AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI

NƏSİMİ ADINA DİLÇİLİK İNSTİTUTU

# AZƏRBAYCAN DİLİNİN İZAHLI LÜĞƏTİ

DÖRD CİLDDƏ

I Cild

ABCÇD

ŞƏRQ-QƏRB

BAKI 2006

*Bu kitab "Azərbaycan dilinin izahlı lüğəti" I cild (Bakı, Azərbaycan Elmlər Akademiyası nəşriyyatı, 1966), II cild (Bakı, Elm, 1980), III cild (Bakı, Elm, 1983) və IV cild (Bakı, Elm, 1987) nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü,
filologiya elmləri doktoru, professor
**Əliheydər Orucovun**
rəhbərliyi və ümumi redaktəsi ilə

Tərtibçilər:

**Əliheydər Orucov, Bəhruz Abdullayev, Nərgiz Rəhimzadə**

Nəşrə hazırlayanı, təkmilləşdirəni və redaktoru:

Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü
filologiya elmləri doktoru, professor
**Ağamusa Axundov**

**494.36131-dc21**
**AZE**
**Azərbaycan dilinin izahlı lüğəti.** Dörd cilddə. I cild. Bakı, "Şərq-Qərb", 2006, 744 səh.

**ISBN10 9952-34-023-0**
**ISBN13 978-9952-34-023-5**

# ÖN SÖZ

“Azərbaycan dilinin izahlı lüğəti” keçən əsrin 40-cı illərindən hazırlanmağa başlansa da, birinci cildi 1966-cı ildə işıq üzü görmüşdür. Həmin cildi görkəmli leksikoqraf və lüğətçi alim, Dövlət mükafatı laureatı, Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, f.e.d., professor Əliheydər Orucov tərtib etmişdi. Lüğətin redaktoru Əkrəm Cəfər idi. Redaksiya heyətinə isə Azərbaycan Milli Elmlər Akademiyasının akademikləri Məmməd Arif Dadaşzadə və Məmmədağa Şirəliyev, o cümlədən Əliheydər Orucov və Rəsul Rüstəmov daxil idilər.

Lüğətin ikinci cildinin nəşri üçün 14 il vaxt lazım oldu. Bu cildin tərtibi ilə f.e.n. Bəhruz Abdullayev, f.e.d., professor Əliheydər Orucov, f.e.n. Nərgiz Rəhimzadə, f.e.n. Məmmədhüseyn Xəlifəzadə və Mikayıl Rzaquluzadə məşğul olmuşdular. Redaktoru Əliheydər Orucov idi. Üçüncü cildin nəşri çox çəkmədi. 3 il sonra oxucular izahlı lüğətin üçüncü cildini də əldə etdilər. Kitabın redaktoru yenə Əliheydər Orucov idi. Redaksiya heyətinə f.e.d., professor Vaqif Aslanov daxil edilmişdi.

Nəhayət, sonuncu – dördüncü cild oxuculara 1987-ci ildə təqdim edildi. Kitabın tərtibçiləri, redaktoru və redaksiya heyəti də dəyişməz qalmışdı.

Beləliklə, 60 illik tərtib, 21 illik çap ömrü olan nəhəng bir lüğət ölkənin həyatında böyük mədəni bir hadisə kimi qarşılanmışdı.

İlk cildinin nəşrindən keçən qırx ilə yaxın zaman ərzində ədəbi dilimizdə, özəlliklə, onun lüğət tərkibində xeyli dəyişikliklərin yaranması, müəyyən qrammatik və üslubi təkmilləşmənin olması tamamilə təbiidir. Şübhə yoxdur ki, bu dəyişikliklər lüğətin sözlüyünə və məqalələrinə də öz təsirini göstərmişdir və bu, öz növbəsində, dilimizin lüğət tərkibinə yenidən nəzər salmağa, lüğəti yeni yaranmış sözlərlə zənginləşdirməyə, lüğət məqalələrində müəyyən redaktə işləri aparmağa ehtiyac doğurmuşdur. Bu sözlər gündəlik həyatımızdan alınıb, oxuculara təqdim olunan bu möhtəşəm lüğətə daxil edilməklə müasirləşdirilmiş, bugünkü oxucular üçün yararlı olmasına çalışılmışdır.

Lüğətin birinci cildinə 150-dən artıq söz əlavə edilmişdir.

Lüğətin kiril əsaslı Azərbaycan əlifbasından latın qrafikalı Azərbaycan əlifbasına keçirilməsi, təbii olaraq, lüğətin quruluşunda, redaksiya heyətinin tərkibində, tərtibçilərin kimliyində müəyyən dəyişikliklərə səbəb olmuşdur. Başqa sözlə, əvvəlki nəşrdə birinci cild A, B, V, Q, ikinci D, E, Ə, J, Z, İ, Y, üçüncü K, G, L, M, N, O, Ö, P, R, dördüncü S, T, U, Ü, F, X, H, Ç, C, Ş hərfləri ilə başlayan sözləri

əhatə edirdisə, indiki nəşrdə birinci cild A, B, C, Ç, D, ikinci cild E, Ə, F, G, H, X, İ, J, K, üçüncü cild Q, L, M, N, O, Ö, P, R, dördüncü cild isə S, Ş, T, U, Ü, V, Y, Z hərfləri ilə başlayan sözlərin şərhinə, izahına həsr olunmuşdur. Beləliklə, birinci nəşrdə hər cild haqqında verilən informativ materiallar yeni nəşrdəki cildlərə uyğun gəlmir. Yəni, birinci cildin "Giriş", "Lüğətdən istifadə üçün lazım olan məlumat", "Əsas mənbələr" bölmələri nəzərə alınmazsa, bütün başqa bölmələr lüğətin quruluşuna, latın qrafikalı əlifbanın tələbinə uyğun olaraq dəyişdirilmiş, məlumat yüklü mətnlər yenidən yazılmış, bəzi informativ qeydlər çıxarılmışdır.

Lüğətin birinci cildinin A və B hərflərini Azərbaycan Milli Elmlər Akademiyasının mərhum müxbir üzvü Əliheydər Orucov, C, Ç və D hərflərini Əliheydər Orucov, filologiya elmləri namizədləri Bəhruz Abdullayev və Nərgiz Rəhimzadə tərtib etmişlər.

Lüğətin "Giriş" və "Lüğətdən istifadə üçün lazım olan məlumat" hissələrini Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü Əliheydər Orucov yazmışdır.

**Ağamusa Axundov**
*Azərbaycan Milli Elmlər*
*Akademiyasının müxbir üzvü*

# GİRİŞ

“Azərbaycan dilinin izahlı lüğəti” müəyyən dərəcədə normativ bir lüğətdir, yəni o: a) sözlərin düzgün işlənmə formasını göstərməyi; b) onların mənalarını və məna incəliklərini verməyi; c) hər hansı bir sözün (və ya onun mənasının) işləndiyi sahənin hüdud və çərçivəsini müəyyən etməyi; ç) sözlərin nə mənada və ya nə kimi tərkiblərdə işləndiyini müxtəlif ədəbi məxəzlərdən götürülmüş sitat, ya misallarla göstərməyi; d) sözlərin qrammatik izahına (xarakteristikasına) müəyyən yer verməyi nəzərdə tutur.

Lüğətin əsas vəzifəsi ədəbi dilimizin lüğət tərkibini əks etdirmək olduğundan və o, normativ xarakter daşıdığından, həm canlı danışıq dilində, həm də ayrı-ayrı dialektlərdə işlənən sözləri toplayıb lüğətə daxil etməyi və onların etimoloji və müqayisəli izahını verməyi ondan tələb etmək olmaz. Lüğətçilik işi ciddi elmi-nəzəri bir prinsip və müəyyən hüdud tələb etdiyi, dilçilik elminin özü konkret sahələrə ayrıldığı bir vaxtda bunu etmək, dilçilik elmi nöqteyi-nəzərindən düzgün sayılmadığı kimi mümkün də deyildir.

İndi lüğətlərin vəzifə və çərçivəsi xeyli məhdudlaşmışdır; onlar: müasir ədəbi dil, etimoloji, tarixi, sinonimik, dialektoloji, frazeoloji və s. kimi lüğətlərə ayrılır ki, bunların da hər biri xüsusi və dərin leksikoloji tədqiqat, geniş və ciddi təşkilat işi tələb edən müstəqil mövzulardır və onları bir lüğətdə sığışdırmaq mümkün deyildir.

* * *

Dilimizin izahlı lüğətini yaratmaq işində ciddi mübahisələrə səbəb olan məsələ lüğətə hansı sözlərin daxil edilməsi, yəni canlı danışıq dilindən, dialektlərdən, klassik ədəbiyyatdan, müxtəlif elm sahələrinə aid terminlərdən hansılarının lüğətə salınması məsələsidir.

Lüğətə daxil ediləcək sözlərin seçilib ayrılmasında klassik və müasir ədəbiyyat, kütləvi elmi-texniki ədəbiyyat, dövri mətbuat və s. əsasında tərtib edilmiş kartotekaya əsaslanılmışdır.

Lüğətə ədəbi dilimizdə işlənən sözlər daxil edilir. Lakin bu o demək deyildir ki, Nəsiminin, Füzulinin və başqa şairlərin əsərlərində təsadüf edilən ərəb və fars sözlərinin (məsələn, Xətayidə: *xişm, şəkkərfəşan, təhəyyür* və s.; Füzulidə: *büqə, müfəvvəz, istitaət, üstüxan* və s.) hamısı Lüğətə daxil ediləcəkdir. Bir qayda olaraq, klassiklərin və başqa müəlliflərin əsərlərindən yalnız o dövrlərdən tutmuş bu günə kimi öz sabitliyini saxlayaraq dilimizdə qalan, yəni müasir dilimizin lüğət tərki-

binə daxil olan sözlər götürülmüşdür. Bu, əlbəttə, M.F.Axundzadə, S.Ə.Şirvani, M.Ə.Sabir və başqa yazıçıların əsərlərində təsadüf edilən ərəb və fars sözlərinə də aiddir. Klassik ədəbiyyatımızda işlənən ərəb və fars sözləri "Klassik Azərbaycan ədəbiyyatında işlənən ərəb və fars sözləri lüğəti" adlı xüsusi lüğətdə verilmişdir.

Lüğətdə Azərbaycan ədəbiyyatının ən yaxşı nümunələrinin leksikasına, bugünkü mətbuatımızın hamı tərəfindən işlənilən leksikasına, əlbəttə, daha geniş yer verilmişdir. Beləliklə, Lüğətdə əsas yeri müasir ədəbi dilimizin leksikası tutur.

Lüğətdə ən böyük çətinlik törədən məsələlərdən biri omonimlər (bir cür yazılan və tələffüz edilən, lakin başqa–başqa mənaya malik olan sözlər) məsələsidir. Məlum olduğu kimi, bu, ümumiyyətlə leksikologiyanın demək olar ki, işlənməmiş məsələlərindən biridir. Bu məsələni yalnız izahlı lüğət tərtibi prosesində birdən-birə və tələsik həll etmək mümkün deyildir. Bu, ciddi və ətraflı tədqiqat tələb edən bir işdir. Buna görə də biz Lüğətdə məsələnin dərin və hərtərəfli təfərrüatına varmadan, omonimlər məfhumunu bir qədər genişləndirmiş və omonimləri çoxmənalı sözlərdən ayırmağa çalışmışıq.

Bütün dillərdə olduğu kimi Azərbaycan dilində də sözlərin çoxu müxtəlif tarixi şəraitdə inkişaf etmək nəticəsində müxtəlif mənalar almışdır. Deməli, eyni bir sözün bir çox mənaları ola bilər. Görkəmli rus dilçisi akad. L.V.Şerbanın dediyi kimi, hər bir söz ümumi mətn içərisində o qədər dialektik və yeni-yeni incə məna fərqləri ifadə etməyə qabildir ki, hər bir deyilən sözdən yanlış məna çıxarmadan fikri dürüst və düzgün ifadə edə bilmək üçün çox böyük məharət lazımdır. Buna görə də Lüğətin ən mühüm və əsas vəzifəsi sözün mənasını (çoxmənalıdırsa mənalarını) izah etmək və ya ona tərif verməkdən ibarətdir.

"Azərbaycan dilinin izahlı lüğəti" yalnız filoloji lüğət olduğu üçün, onun vəzifəsi oxucunu bəhs olunan əşya və ya hadisənin özü ilə tanış etmək deyil, ancaq sözün özünü başa düşmək üçün kifayət edəcək məlumat verməkdən, yəni onun leksik mənasını izah etməkdən ibarətdir. Ona görə də bu Lüğətdən əşya və hadisələr haqqında tam və bitkin məlumat tələb etmək olmaz, çünki belə bir tələbi ödəmək başqa tipli lüğətlərin, ensiklopediyaların vəzifəsidir. Odur ki, oxucu Lüğətdə sözlərin izahını oxuyarkən, bunların mümkün qədər qısa və yığcam verildiyini nəzərdə tutmalıdır.

Məlum olduğu kimi, dildə işlənən sözlərin əsas hissəsini neytral sözlər, yəni dilin bütün üslublarında işlənən sözlər təşkil edir. Lakin bununla yanaşı olaraq dildə elə sözlər də vardır ki, onların işlənmə sahəsi məhduddur. Buna görə də Lüğətdə gedən sözləri üslub cəhətdən xarakterizə etmək, yəni sözün hansı üsluba aid olduğunu göstərmək üçün müvafiq işarələr sistemi tətbiq edilir. Həmin işarələr yalnız o sözlərin yanında qoyulur ki, bunlar digər sözlərdən bu və ya başqa cəhətdən fərqlənmiş olsun.

Lüğətdə müasir dilimizin frazeologiyası – idiomlar, söz birləşmələri (tərkiblər) və s. də müəyyən yer tutur. Frazeologiya, əlbəttə, yalnız yuxarıda göstə-

rilənlərdən ibarət deyildir; onun mənası daha genişdir. Frazeologiya dedikdə, dildə olan sabit söz birləşmələrinin məcmusu nəzərdə tutulur. Frazeologiyaya eyni zamanda məsəllər, atalar sözü, sabit bir şəkil almış tərkiblər, aforizmlər və s. də daxildir. Bunlar Lüğətdə müstəqil sözlər kimi deyil, yalnız mənanı (ya mənaları) aydınlaşdırmaq üçün misal və ya sitat kimi verilir.

Lüğətdə frazeoloji ifadələrin harada yerləşdirilməsi məsələsi də lüğətçilik işində çətin və mübahisəli məsələlərdən biridir. Bu məsələnin həllində, əsasən, praktik cəhəti, yəni Lüğətdə frazeoloji ifadənin tez tapılmasını asanlaşdıracaq prinsipi daha üstün tutulur.

Yuxarıda söylənildiyi kimi, Lüğət müasir ədəbi dilimizin bütün leksikasını əks etdirməyi nəzərdə tutur. Lakin bu heç də o demək deyil ki, Lüğət xaricində heç bir söz qalmamışdır. Belə bir iddia, əlbəttə, heç də doğru olmazdı. Çünki dil elə bir xəzinədir ki, onu məhdud bir müddət içərisində tam şəkildə qavramaq mümkün deyil. Bundan əlavə, çox ola bilsin ki, Lüğətə düşmüş sözlərin mənalarının, yaxud məna incəliklərinin hamısını qavraya bilməmişik (bu, işin ən çətin cəhətidir). Çox mümkündür ki, bəzi sözlərə verdiyimiz izah da bəzi oxucuları təmin etməsin. Belə hallarda oxucular iki şeyi, əvvələn, hər bir lüğətin həyatdan daim geri qaldığını (lüğət çapdan çıxınca yeni sözlər meydana gəlir), ikincisi, Lüğətdə sözlərə izah verilərkən onların bu və ya digər bir yerdə işlənən məhəlli mənalarının deyil, xalqımızın əksəriyyəti tərəfindən başa düşülən və işlədilən mənalarının verildiyini nəzərdə tutmalıdırlar.

Lüğətdə əcnəbi sözlərin, xüsusən, Qərbi Avropa sözlərinin mənşəyinin verilməsi məsələsi də çətinlik törədən məsələlərdən biridir. Çünki, məlum olduğu kimi, əcnəbi sözlərin çoxu müxtəlif dillərdə əslində olduğu kimi yazılmır və işlənmir. Bir çox sözlər bir dildən başqasına keçərək, həmin dilin xüsusiyyətlərinə uyğun bir şəkildə yazılır və tələffüz edilir. Bəzən isə bu sözlər (həm Avropa, həm də ərəb və fars sözləri) müxtəlif dillərə aid sözlər olur. Məsələn, "avtoportret" sözünün tərkibindəki *avto* yunanca, *portret* isə fransızcadır, "aqrokimya" sözündəki *aqro* yunanca, *kimya* isə ərəbcədir, yaxud "tərifnamə" sözündə *tərif* ərəbcə, *namə* isə farscadır. Belə hallarda sözü bu və ya digər dilə aid etmək doğru olmur, çünki bunlar müxtəlif dillərin leksik ünsürlərindən düzəlmiş sözlərdir. Buna görə də, Lüğətdə belə sözlərdə hər bir ünsürün (sözün) mənşəyi ayrılıqda göstərilir.

Bu və ya digər sözün dildə, həqiqətən, mövcud olduğunu təsdiq etmək, habelə sözün mənalarına verilən izahı və ya tərifi daha da aydınlaşdırmaq üçün, bir qayda olaraq, Lüğətdə sitatlar və tərtibçinin – müəllifin özü tərəfindən düzəldilmiş misallar şəklində illüstrativ material verilir.

Bu sitatlar anadilli ədəbiyyat tariximizin görkəmli nümayəndələrinin – klassik şairlərimizin və yazıçılarımızın əsərlərindən, klassiklərin əsərlərinin tərcümələrindən (siyasi, iqtisadi, ictimai, fəlsəfi terminlər üçün), xalq yaradıcılığına aid əsərlərdən, nadir hallarda isə tərcümə əsərlərindən (keçmiş rus məişət və həyatını əks

etdirən sözlər üçün), orta məktəb dərsliklərindən (terminlərin tərifləri üçün), dövri mətbuatdan, habelə elmi-kütləvi əsərlərdən götürülmüşdür.

Lakin qeyd etməliyik ki, bu və ya başqa səbəbə görə Lüğətdə sözlərin və onların mənalarının hamısına sitat vermək mümkün olmamışdır. Bəzən buna ehtiyacı olan sözlər və mənalar üçün də sitat tapmaq mümkün olmamışdır. Belə sözlər (sitatsız verilmiş sözlər) yazılı məxəzlərdən götürülmüş və dilimiz üçün faydalı olduqları nəzərə alınaraq, Lüğətə daxil edilmişdir.

Sözlərin qrammatik xarakteristikası məsələsinə gəldikdə, burada da başqa bir çətinliyə rast gəlinir. Bu çətinlik bəzi sözlərin, xüsusən, dilimizdə işlənən bir sıra ərəb və fars sözlərinin hansı nitq hissəsinə aid edilməsi məsələsi ilə bağlıdır. Buraya *vaqe, vadar, vagüzar, zikr, rədd, cəzb* qəbilindən olan sözlər daxildir. Bu kimi sözlər Azərbaycan dilində təklikdə çox az, adətən, köməkçi feil ilə birgə işlənir. Bu məsələ haqqında Azərbaycan dilinin qrammatikasında hələ müəyyən bir söz deyilmədiyindən, oxucuları çaşdırmamaq üçün belə sözlərdə qrammatik işarə verməməyi daha məqsədəuyğun gördük.

Lüğətdə sinonimlərə də böyük yer verilir. Lakin təbiidir ki, Azərbaycan dilinin sinonimikasını müntəzəm surətdə təsvir etmək vəzifəsini Lüğət öz qarşısına qoymur və qoya da bilməz. Sinonimlərdən əksər hallarda və əsasən, sözün mənasının izahına yardım edən əlavə bir vasitə kimi istifadə edilir.

# LÜĞƏTDƏN İSTİFADƏ ÜÇÜN LAZIM OLAN MƏLUMAT

## I. SÖZLÜYÜN TƏRKİBİ (SÖZLƏRİN SEÇİLMƏSİ)

**1.** "Azərbaycan dilinin izahlı lüğəti" müəyyən dərəcədə normativ bir lüğət olduğundan, canlı danışıq dilində və onun ayrı-ayrı dialektlərində işlənən sözlərin hamısını əhatə etmir. Öz qarşısında duran vəzifəyə uyğun olaraq, Lüğətə bu günə qədər Azərbaycan ədəbi dilində geniş miqyasda işlənən bütün sözlər daxil edilir. Bu sözləri, əsasən, aşağıdakı qruplara ayırmaq olar:

1) Dilimizin lüğət tərkibinin ayrılmaz bir hissəsini təşkil edən xüsusi və terminoloji sözlər.

Lakin bu və ya digər elmi terminin Lüğətə daxil edilməsi üçün əsas şərt, həmin terminin adi həyatda oynadığı rol və az-çox geniş yayılmasıdır. Məlum olduğu kimi, tibb, biologiya, texnika, botanika və s. sahəsində minlərlə, on minlərcə termin vardır ki, bunların əksəriyyəti çox məhdud ixtisar çərçivəsində işlənən sözlərdir. Bunları vermək xüsusi terminoloji lüğətlərin vəzifəsidir. Buna görə də Lüğətə ədəbi dilimizin lüğət tərkibinə daxil olmuş terminlər, yəni ümumtəhsil məktəbləri üçün Azərbaycan dilində yazılmış, yaxud bu dilə tərcümə edilmiş dərsliklərdə işlədilən terminlər, həmçinin kütləvi-elmi ədəbiyyatda və ümumi mətbuatda təsadüf edilən və dar ixtisasa aid olmayan terminlər daxil edilir.

2) Vaxtı ilə dilimizin lüğət tərkibinə girmiş, indi isə yalnız keçmiş həyatın müxtəlif cəhətlərini əks etdirmək naminə lazım olan və geniş oxucu kütləsi üçün yazılan, müxtəlif ədəbiyyatda işlədilən köhnəlmiş sözlər; məs.: *yüzbaşı, biyar, bəy, qoçu, töycü, bəzzaz, zadəgan, baqqal, meyxanaçı* və s.

3) İndi tarix kitablarında və digər ədəbiyyatlarda termin kimi işlənərək, müxtəlif tarixi dövrlərin məişət və həyati cəhətlərini əks etdirən qədim sözlər; məs.: *bəylərbəyi, kələntər, xaqan, sərdar* və s.

4) Başqa xalq və tayfaların adları: a) müasir xalqların adları; məs.: *çexlər, macarlar, çinlilər, almanlar, fransızlar*; b) indi mövcud olmayan, lakin vaxtilə dünya tarixində müəyyən rol oynamış xalq və tayfaların adları; məs.: *skiflər, xəzərlər, peçeneqlər, assurilər, hunlar* və s.

*Qeyd.* Bu adlar Lüğətdə, adətən, tək şəkildə, az işlənən tayfa adları isə cəm şəkildə verilir.

5) Tarixi və əsatiri şəxsiyyət adlarından yalnız məcazi və simvolik mənalarda işlənənləri; məs.: *əflatun* (çox bilikli, müdrik adam mənasında), *loğman* (mahir həkim mənasında), *hatəm* (səxavətli adam mənasında) və s.

6) Xalq arasında və ədəbiyyatda işlənən din və dini ayinlərlə əlaqədar sözlər; məs.: *namaz, ziyarət, dua, huri, mələk, behişt* və s.

7) Məhəlli sözlərdən (dialektizmlərdən): a) respublikamızın müxtəlif rayonlarında və ya şifahi xalq yaradıcılığında az-çox yayılmış, buradan da ümumxalq dilinə, habelə kənd məişətinin təsviri ilə əlaqədar olaraq ədəbi dilə keçmiş sözlər; b) termin kimi işlənilə bilən və ümumiyyətlə, termin yaratmaq üçün əhəmiyyəti olan və ədəbi dildə qarşılığı olmayan kənd təsərrüfatına, müxtəlif sənət və peşələrə aid sözlər, bitki, heyvan, balıq və s. adları; məs.: *arançı, üçəm, zing, çeşid, daxal, kaha, qənbər, xama, kəsmik* və s. Bu kimi sözlər Lüğətə ümumi dilimizə aid sözlər kimi daxil edilsə də, onların dialektizm olduğu müvafiq işarələrlə göstərilir.

8) Defislə yazılan mürəkkəb sözlər: a) isimlər; məs.: *gecə-gündüz, əmin-amanlıq, gediş-gəliş, ata-ana, dağ-daş, arvad-uşaq* və s.; b) zərflər; məs.: *gülə-gülə, tez-tez, yavaş-yavaş, qol-qola* və s.

9) Bədii, siyasi və digər ədəbiyyatda geniş yayılmış, həmçinin canlı dildə işlənən mürəkkəb ixtisar sözlər və hərfi ixtisarlar; məs.: *raykom, komsomol, kolxoz, sovxoz, partkom, partbilet, SSRİ* və s.

10) İsim və sifətlərin ən çox işlənən kiçiltmə və oxşama formaları; məs.: *daxmacıq, kiçicik, hissəcik, uşaqcığaz, quşcuğaz, göycüyəz* və s.

11) Müxtəlif şəkildə düzəldilmiş səs təqlidi sözlər; məs.: *qurultu, şaqqıltı, vaqqıltı, miyov-miyov, cik-cik, şıq-şıq* və s.

12) Feli sifətlərdən yalnız substantivləşənlər (isimləşənlər) və ya sifət kimi işlənilə bilənlər; məs.: *oxuyan* (xanəndə mənasında), *çalan* (çalğıçı mənasında), *qapan, tutan* (qapan it, tutan it mənasında) və s.

13) Bir yerdə yazılan saylar (miqdar və sıra sayları), ədatlar (məs.: *hə, axı, kaş* və s.); qoşmalar (məs.: *üçün, qarşı, başqa* və s.); bağlayıcılar (bir yerdə yazılanlar) və ara sözlər (məs.: *əlbəttə, beləliklə, şübhəsiz, görünür, deməli, həqiqətən, deyəsən, görəsən* və s.).

14) Mürəkkəb sözlərin yeni sözdüzəltmə cəhətdən məhsuldar olan tərkib hissələri; məs.: *...xana, ...şünas, ...oxşar, aqro..., elektro..., radio..., bio...* və s.

**2.** Lüğətə bu sözlər daxil edilmir: a) ölkə, dəniz, çay, dağ, şəhər və s. bu kimi coğrafi adlar; b) yerli əhali adları (məs.: *bakılı, qarabağlı* və s.); c) şəxs adları; ç) bu və ya digər formada yazıçı və müəllifin icadı olan, yaxud onun tərəfindən yanlış işlənən və başqa yazıçı və müəlliflərin əsərlərində təsadüf edilməyən sözlər (məs.: *baharlı, axşamlı, qaralışmaq, vətənçi, viranlamaq* və s.); d) müasir ədəbi dilimizdə işlənməyən qəliz ərəb və fars sözləri; e) yalnız bir məhəllə və məhdud peşəkarlıq mühitinə aid olan və başqaları tərəfindən başa düşülməyən arqotizmlər (məs.: *avaqa, ceydaraq, qacalov, hinqlov* və s.); ə) ədəbsiz sözlər və söyüşlər.

## II. LÜĞƏTİN QURULUŞU

**3.** Lüğətdə baş sözlər əlifba sırası ilə verilir.

**4.** Lüğət maddələrinin başlığını: a) isimlər; b) sifətlər; c) saylar; ç) əvəzliklər; d) feillər; e) zərflər; ə) bağlayıcılar; f) nidalar; g) ədatlar; ğ) ara sözləri; h) səs təqlidi sözlər təşkil edir.

**5.** Bir məfhum bildirən, lakin mövcud imlaya görə ayrı yazılan mürəkkəb sözlər (məs.: *ağ neft, dağ bülluru, əl ağacı*) əsas sözlərin (yəni **neft, büllur, ağac** sözlərinin) maddəsində verilir.

**6.** Baş sözlərdən sonra, onun hansı nitq hissəsinə aid olduğu göstərilir. Lazım gəldikdə sözün, yaxud onun mənasının hansı sahəyə aid olduğunu göstərən üslubi işarələr verilir.

*Qeyd.* Başqasına baxdırılan sözlərdə nitq hissəsi göstərilmir, çünki onların nitq hissəsi baxılacaq sözün nitq hissəsinin eynidir.

**7.** Əcnəbi sözlər bu qaydada verilir:

a) əcnəbi sözlərin qabağında düz mötərizədə hansı dilə aid olduğu göstərilir:

**ATƏŞ** [*fars*.]

**AVANQARD** [*fr*.]

**AVRAL** [*ing*.]

**MÜƏLLİM** [*ər*.]

b) tərkibi başqa-başqa dillərə aid sözlərdən ibarət olan mürəkkəb sözlərdə mənşə aşağıdakı şəkildə verilir:

**AB-HAVA** [*fars*. ab və *ər*. həva]

**AQROMİNİMUM** [*yun*. aqro və *lat*. minimum]

**AVTOPORTRET** [*yun*. avto və *fr*. ...portret]

**MÜQAVİLƏNAMƏ** [*ər*. müqavilə və *fars*. namə].

*Qeyd*. Azərbaycan dili şəkilçiləri vasitəsi ilə alınma sözlərdən düzələn feillərin, sifətlərin və s.-nin yanında mənşə göstərilmir;

c) həm şəkil, həm də tələffüzcə azərbaycancalaşmış əcnəbi sözlərin mənşəyi göstərilmir;

ç) tərkib hissələrindən biri azərbaycanca olan (məs.: *aqreqatçı, futbolçu, dastançı, qəzetçilik* kimi) sözlərdə mənşə göstərilmir;

d) ilk mənşəyi ərəb, fars, yaxud türk dillərinə gedib çıxan əcnəbi sözlərin ilk mənşəyi göstərilir; məsələn:

**ADMİRAL** [*ər.* "əmirülbəhr" sözündən]

**ÇAMADAN** [*fars.* "camədan" sözündən]

**KARANDAŞ** [*türk.* "qara daş" sözündən];

e) əcnəbi sözün mənşəyi bəlli olmadıqda, yaxud mübahisəli olduqda, sadəcə "*xar.*" (yəni "xarici sözdür") işarəsi qoyulur;

ə) əcnəbi sözün azərbaycanca qoşa variantı (sinonimi) olduqda izah, bir qayda olaraq, azərbaycancasında verilir; məsələn:

**KAKTUS** b a x **maldili**.

**METATEZA** b a x **yerdəyişmə**.

f) lüğətdə əcnəbi sözlərin əslində olan bütün mənaları deyil, ancaq Azərbaycan dilində işlənən mənaları verilir;

g) klassik ədəbiyyatda və köhnə mətbuatda bəzən cəm şəklində işlənən ərəb sözlərinin cəm şəkli də baş söz kimi verilir; məsələn:

**ƏŞYA** *is.* [*ər.* "şey" söz. cəmi]

**ÜLƏMA** *is.* [*ər.* "alim" söz. cəmi]

**VÜZƏRA** *is.* [*ər.* "vəzir" söz. cəmi]

**8.** Omonimlər, yəni mənaca ayrı, yazılış və tələffüzcə bir olan sözlər, sözün sağından yuxarıda rəqəmlərlə işarə olunaraq, müstəqil sözlər kimi verilir; məsələn:

**ALICI**$^1$ *is*. (müştəri).

**ALICI**$^2$ *sif*. (quş haqqında).

**QAZ**$^1$ *is*. *zool*. (ev quşu).

**QAZ**$^2$ *is*. *kim*. (kimyəvi maddə).

**QAZ**$^3$ *is*. (yüngül, şəffaf parça).

**9.** Sözlərin variantları əlifba sırası ilə bir-birinin ardınca gəldikdə, bu sözlər yan-yana baş söz kimi verilir və aralarında vergül qoyulur; məs.: ARFAÇALAN, ARFAÇI.

Əlifba sırası ilə dalbadal gəlməyən variantlar isə öz əlifba sırasında verilir.

**10.** Sözlərin həm şəkilçi ilə, həm də şəkilçisiz işlənən variantlarında şəkilçilər mötərizə içərisinə alınır; məs.: ALAGÖZ(LÜ), BAĞIŞLAN(IL)MAZ və s.

**11.** İsimlə köməkçi feildən düzələn tərkiblər, mürəkkəb feillər və başqa ifadələr aid olduqları mənaların bəndlərində, izahdan sonra verilir. Bunlar □ işarəsi ilə izahdan ayrılır. Mənaların heç biri ilə uyğun gəlməyən ifadələr (idiomlar), həmçinin məcaziləşmiş məna daşıyan söz birləşmələri ən axırda abzasdan və ◊ işarəsindən sonra verilir.

**12.** Yalnız tərkib şəklində işlənən sözlər bu qaydada verilir: baş sözdən sonra iki nöqtə qoyulur və sonra həmin tərkib (söz birləşməsi) yazılır və onun ardınca da ümumi qaydada izah verilir; məsələn:

**DƏRK: dərk etmək...**

**ŞƏKLƏMƏK: qulaqlarını şəkləmək...**

**VAZ$^2$: vaz keçmək...**

## III. SÖZLƏRİN MƏNACA XARAKTERİSTİKASI

**13.** Lüğətin əsas vəzifəsi sözün mənasını (çoxmənalıdırsa mənalarını), habelə məna incəliklərini açıb göstərməkdir. Mənaların izahına müxtəlif məxəzlərdən alınmış sitat və misallar əlavə olunur.

**14.** Hər bir məna yeni sətirdən başlanır, məna incəlikləri isə // işarəsi ilə ayrılır və aid olduqları mənanın bilavasitə ardınca verilir.

**15.** Sözün mənalarının tarixi inkişafı Lüğətdə bu qaydada əks etdirilir: əgər sözün tarixən bir-birindən fərqli olan bir neçə mənası varsa, sözün məna inkişafı onun müasir mənasının tərifindən başlanır; sözün əvvəlcə bugünkü mənası sonra isə köhnəlmiş mənaları verilir. Lakin bu üsul ancaq bu gün üçün aktual olan sözlərin izahının sıralanmasında tətbiq olunur.

**16.** Çoxmənalı sözlərin mənaları aşağıdakı qaydada sıralanır:

a) sözün mənalarından biri aktual siyasi əhəmiyyətə malikdirsə, onda bu məna mümkün qədər birinci yerə keçirilir və geniş izah edilir; məsələn, "İNQİLAB" sözündə əvvəlcə onun bugünkü mənası ("zorakı ictimai çevriliş; dövlət hakimiyyətinin hakim sinfin əlindən başqa sinfin əlinə keçməsi"), sonra isə başqa mənaları verilir;

b) sözün mənaları eyni dərəcədə işlənirsə, birinci növbədə onun ən çox işlənən mənası verilir; məsələn, "KAĞIZ" sözündə birinci olaraq onun yazı üçün bir material olduğu, sonra isə rəsmi sənəd (yaş kağızı, məktub və s.) olduğu göstərilir;

c) sözün açıq-aydın ifadə olunmuş həqiqi və məcazi mənası varsa, birinci növbədə onun həqiqi mənası verilir.

## İsimlər

**17.** Kiçiltmə və oxşama şəkilçiləri ilə düzələn törəmə isimlər bu qaydada verilir:

**KÜRƏCİK** *is*. 1. Kiçik kürə.

2. *fiziol*. Qanın tərkib hissəsi.

**QIZCIĞAZ** "Qız"dan *oxş*.

**18. -ma (-mə)** şəkilçisi ilə feillərdən əmələ gələn isimlər bu cür verilir:

**YARMA** 1. "Yarmaq"dan *f.is.*

2. Dingdə döyülmüş dən.

**SÜZMƏ** 1. "Süzmək"dən *f.is.*

2. Suyu süzülmüş qatıq.

*Qeyd*. Feli isimliyini itirmiş sözlər müstəqil isim kimi verilir, məs.: **qazma, titrətmə, qızdırma**, habelə **dolma** kimi xörək adı və s.

**19.** Sifətdən düzələn mücərrəd isimlər bu cür verilir:

**DURULUQ** *is*. Duru şeyin halı.

**DAVAKARLIQ** *is*. Davakar adamın xasiyyəti.

**YENİLİK** *is*. Yeni xəbər, yeni şey, yeni ixtira və s.

## Sifətlər

**20.** Başqa dillərdən alınma şəkilçilər vasitəsi ilə düzələn sifətlər bu cür verilir:

a) **-l** şəkilçisi ilə düzələn sifətlər:

**FORMAL** *sif*. 1. Formaya xas olan, formanın xasiyyətləri ilə əlaqədar olan.

2. Formalizm prinsipi əsasında qurulmuş, formalizmə əsaslanan.

b) **-iv** şəkilçisi ilə düzələn sifətlər:

**OBYEKTİV** *sif. fəls.* Şüurdan asılı olmayaraq mövcud olan; obyektin özünə xas və ya müvafiq olan.

c) **–ik** şəkilçisi ilə düzələn sifətlər:

**TİPİK** *sif.* 1. Müəyyən tipə xas olan, müəyyən tipi təmsil edən.

2. Müəyyən xüsusiyyətlərə malik olan; səciyyəvi.

ç) **–tik** şəkilçisi ilə düzələn sifətlər:

**QRAMMATİK** *sif.* Qrammatikaya aid olan, qrammatikaya əsaslanan.

d) **–atik** şəkilçisi ilə düzələn sifətlər:

**DRAMATİK** *sif.* Dramaya aid olan.

**SİSTEMATİK** *sif.* Sistemli surətdə.

e) **–loji** şəkilçisi ilə düzələn sifətlər:

**BİOLOJİ** *sif.* Biologiyaya aid və ya xas olan.

ə) **–bi** şəkilçisi ilə düzələn sifətlər. Bu tip sifətlərin azərbaycanca **–sız (–siz, –suz, –süz)** şəkilçisi ilə işlənən qoşa variantı varsa, izah bu variantda verilir; məsələn:

**BİƏDƏB** b a x **ədəbsiz.**

**BİSAVAD** b a x **savadsız.**

**BİVƏFA** b a x **vəfasız.**

## Feillər

**21.** Feillər məsdər şəklində verilir. Lüğətdə felin məlum, məchul, qarşılıqlı, icbar, qayıdış növləri verilir; məsələn:

**ALMAQ** *f.* ...

**ALDIRMAQ** *icb.* ...

**YAZILMAQ** *məch*. ...

**YAZIŞMAQ** *qarş.* ...

**YUYUNMAQ** *qayıd.* ...

*Qeyd.* Qrammatik izah üsulu feillərə leksik izah verilə bilmədiyi hallarda tətbiq edilir.

Felin mənaları başqa–başqa formalara aid olduqda, qrammatik işarə sözün qabağında deyil, hər bir mənanı ayıran rəqəmdən sonra verilir; məsələn:

**ATILMAQ** 1. "Atmaq"dan *məch*.

2. *t–siz*. Bir şeyin üstündən hoppanmaq, hoppanıb tullanmaq.

3. *t–siz.* Cəld yönəlmək, yerimək, yüyürmək, cummaq, üz tutmaq, özünü atmaq. *// t–siz.* Sıçramaq, hücum etmək.

*Qeyd.* Feillərin inkarı bir qayda olaraq, Lüğətdə verilmir. Lakin onların yalnız müstəqil məna (əsasən, terminoloji xarakter) daşıyan və kökü inkar formasında olan qismi Lüğətə daxil edilir; məsələn; *ağrısızlaşdırmaq, qansızlaşdırmaq, oksigen–sizləşdirmək.*

## Zərflər

**22.** Yalnız formal əlamətləri olan zərflər müstəqil baş söz kimi verilir. Zərf yerində işlənən sifətlər isə sifət kimi verilir.

*Qeyd.* Bu sifətlər mətn (sitat) içərisində zərf mənasında olursa, mötərizədə (z.) işarəsi qoyulur.

Lüğətdə zərflərin aşağıdakı tipləri verilir:

a) **–ca (–cə)** şəkilçisi ilə düzələn zərflər; məs.: *ayrıca, qabaqca, əvvəlcə, özbəkcə* və s.;

b) **–casına (–cəsinə)** şəkilçisi ilə düzələn zərflər; məs.: *qəhrəmancasına, insancasına, vəhşicəsinə* və s.;

c) **–ən** şəkilçisi ilə düzələn zərflər; məs.: *qəsdən, qəflətən, tədricən, əksərən* və s.;

ç) **–la (–lə)** şəkilçisi ilə düzələn zərflər; məs.: *aramla, tədriclə, ümumiyyətlə* və s.;

d) **–cadan (–cədən)** şəkilçisi ilə düzələn zərflər; məs.: *yavaşcadan, qabaqcadan, əvvəlcədən* və s.;

e) **–dan (–dən)** şəkilçisi ilə düzələn zərflər; məs.: *bayaqdan, çoxdan, birdən, qəfildən* və s.;

ə) sözlərin təkrar edilməsi ilə düzələn zərflər; məs.: *boş–boş, gec–gec, tez–tez, bilə–bilə, doğram–doğram* və s. (bunlar müstəqil baş söz kimi deyil, əsas sözün izahlarından sonra abzasdan qara hərflərlə verilir);

f) **ba (bə)** bitişdiricisi vasitəsi ilə sözlərin bir–birinə qoşulmasından düzələn zərflər; məs.: *dalbadal, yanbayan, üzbəüz, taybatay* və s.;

g) mənaca bir–birinə yaxın və zidd olan sözlərin qoşalaşdırılması yolu ilə düzələn zərflər; məs.: *ara–sıra, az–çox, alt–üst, gec–tez* və s.

## IV. SÖZLƏRİN QRAMMATİK XARAKTERİSTİKASI

**23.** Baş sözün yanında onun qrammatik xarakteristikası verilir, yəni onun hansı nitq hissəsinə aid olduğu göstərilir.

*Qeyd.* Qrammatik işarə, bir qayda olaraq baş sözə aiddir. Verilən misallardakı müvafiq söz cümlə içərisində baş sözə verilən qrammatik işarəyə uyğun gəlməyə bilər.

**24.** İsimlər adlıq halda və tək şəkildə verilir (xüsusi elmi terminlərdən və bəzi tayfa adlarından başqa), məsələn:

**BARMAQ** *is.* 1. İnsanın və bəzi heyvanların əl və ayaqlarındakı beş mütəhərrik üzvdən hər biri.

2. ...

**XƏBƏR** *is.* [*ər.*]. 1. ...

2. Yalnız cəm şəklində: XƏBƏRLƏR – vaxtaşırı nəşr edilən bəzi məcmuələrin adı. *Azərbaycan Milli Elmlər Akademiyasının* "*Xəbərlər*"*i.*

**QOŞADIRNAQLILAR** *cəm, zool.* Eyni dərəcədə inkişaf etmiş qoşa dırnağı olan məməli heyvanlar dəstəsi.

**25.** Substantivləşmiş (isimləşmiş) sifətlər bu qaydada verilir:

**XƏSTƏ** *sif.* [*fars.*]. 1. ...

2. *İs. mənasında.* Xəstə adam. *Xəstələrin müayinəsi. Xəstələri sağlamlardan ayırmaq.*

**GÖZƏL** *sif.* 1. ...

2. *İs. mənasında.* Gözəl qadın (qız). – *Gələndə at başı tutan*, *Şux gözəllər yerindəmi?* "Koroğlu".

**26.** Əvəzliklər adlıq halda və tək şəkildə verilir. Onların qrammatik işarəsi "*əvəz.*" şəklində verilir.

**27.** Sayların qabağında müvafiq qrammatik işarələr qoyulur: "*miqd. s.*", "*sıra s.*".

**28.** Başlıqda feillər məsdər şəklində verilir. Lüğətdə felin məlum, məchul, qayıdış, qarşılıqlı, icbar növləri verilir.

Bunların qabağında müvafiq qrammatik işarələr qoyulur; məs.: QURMAQ *f.,* QURUDULMAQ *məch.,* YUYUNMAQ *qayıd.,* YAZIŞMAQ *qarş.,* YAZDIRMAQ *icb.*

**29.** Qoşmaların qrammatik işarəsi "*qoş.*", bağlayıcıların "*bağl.*", ədatların "*əd.*" şəklində verilir.

**30.** Xarici dillərdən, bir qayda olaraq, sözlər (ərəb və fars sözlərindən başqa) yalnız isim halında götürüldüyündən, onların yanında qrammatik işarə qoyulmur.

Yalnız sifətlər Azərbaycan dilində başqa formada düzəldildiyindən, onların yanında qrammatik işarə (*sif.*) qoyulur.

## V. SÖZLƏRİN ÜSLUBİ XARAKTERİSTİKASI

**31.** Ədəbi dildə işlənməsi məhdud olan sözlərin üslubca xüsusiyyətini göstərmək üçün Lüğətdə aşağıdakı işarələr sistemi tətbiq olunur:

a) canlı danışıq dilinə məxsus olan sözlər üçün: *dan.*;

b) məhəlli sözlər üçün: *məh.*;

c) geniş surətdə işlənməyən və əsasən, kitab dilinə məxsus olan sözlər üçün: *kit.*;

ç) ədəbi dil normalarına müğayir olan qaba (vulqar) sözlər üçün: *vulq.*;

d) hökumət sənədləri, qərarlar, rəsmi kağızlar, ümumiyyətlə, rəsmi dildə işlənən sözlər üçün: *rəs.*;

e) xüsusi terminlər olduqda, onların aid olduğu elm və s. sahəsinin adı göstərilir; məs.: *fəls.*, *bot., zool., tib.* və i.a.; texnikaya aid terminlər üçün: *tex.*; müəyyən bir elm sahəsinə aid olan xüsusi sözlər üçün: *xüs.*;

ə) şeir dilində işlənən və bədii təsvirlərə aid olan şairanə sözlər üçün: *şair.*;

f) klassik ədəbiyyat dilinə məxsus ərəb və fars söz və ifadələri üçün: *klas.*;

g) din, dini etiqad və ayinlərlə əlaqədar olan sözlər üçün: *din.*;

ğ) çox qədim dövrlərə aid sözlər üçün *qəd.*; bugünkü dilimizdə olan köhnəlmiş sözlər üçün: *köhn.*

h) tarixi keçmişə, yəni çoxdan ötüb keçmiş dövrlərə aid olan sözlər üçün: *tar.*;

x) uşaq dilinə məxsus sözlər (məs.: *pəpə, cici, qağa* və s.) üçün: *uş.*;

ı) istehza, kinayə, zarafat, nifrət və s. kimi hissləri ifadə edən sözlər üçün: *isteh., kin., zar., nifr.* və i.a.

**32.** İşarələr sözün mənasının, yaxud mənalarının izahından qabaq verilir. Əgər işarə bütün nömrələrdən əvvəl, bilavasitə baş sözdən sonra gəlirsə, bu o deməkdir ki, işarə sözün bütün mənalarına aiddir.

**33.** Lüğətdə geniş surətdə işlənən bir çox xüsusi və terminoloji sözlər də verilir. Onların işlənmə sahəsi iki üsul ilə ayrılır:

a) terminin və ya sözün hansı sahəyə aid olduğu tərifin özündə göstərilir (bu kimi hallarda heç bir işarə qoyulmur), məsələn:

**BUR** [*alm.*]. Texnikada torpağı və süxurları tədqiq etmək məqsədi ilə müxtəlif quyular qazmaq üçün işlədilən burğu aləti.

**RÜBAİ** *is.* [*ər.*]. Fars, ərəb şeir ölçüsündə: dördmisralı, yəni iki beytdən ibarət şeir parçası.

b) terminin və ya sözün hansı sahəyə aid olduğu tərifdən (izahdan) lazımınca aydın olmadıqda müvafiq işarə qoyulur.

## VI. FRAZEOLOGİYA

**34.** "Azərbaycan dilinin izahlı lüğəti"nə frazeologiya, yəni tərkib hissələri müəyyən dərəcədə bir-biri ilə bağlı olub, bir məna ifadə edən sabit söz birləşmələri də daxil edilir.

**35.** Lüğətə aşağıdakı tipli frazeoloji tərkiblər daxil edilir:

a) ictimai-siyasi və kütləvi-elmi kitablarda, qəzet və jurnallarda geniş surətdə işlədilən terminoloji xarakterli sabit söz birləşmələri; məs.: *sinfi mübarizə, donma dərəcəsi, mineral gübrələr, mədən suları, ictimai sığorta* və s.

Bu kimi ifadələr əlaqədar olduqları sözlər üçün misal kimi verilir; məs.: *sinfi mübarizə* – **"sinfi"** sözü üçün və s.;

b) əşya adlarını (mürəkkəb adları) təşkil edən sabit söz birləşmələri; məs.: *qara ciyər, əl ağacı, ağ neft* və s. (bunlar müvafiq surətdə **"ciyər"**, **"ağac"**, **"neft"** sözlərinin maddəsində verilir).

**36.** İki ismin birləşməsindən ibarət olan ifadələr (əgər isimlərdən biri təyin yerində və mənaca daha əhəmiyyətli isə) həmin sözün (təyinin) altında verilir; məsələn: *dil pəhləvanı, can dərmanı, buz baltası, dil bəlası, qaynama dərəcəsi* kimi ifadələr müvafiq surətdə: **"pəhləvan"**, **"can"**, **"buz"**, **"dil"**, **"qaynama"** sözlərində verilir.

**37.** İsimlə köməkçi feildən düzələn sabit söz birləşmələri (mürəkkəb feillər, tərkiblər və s.) bir qayda olaraq, birinci sözün (ismin) maddəsində, əlaqədar olduqları mənanın izahından sonra verilir; məs.: *biabır olmaq, qələbə çalmaq, qarşı durmaq* ifadələri müvafiq surətdə: **"biabır"**, **"qələbə"**, **"qarşı"** sözlərinin müvafiq mənalarının izahından sonra ☐ işarəsindən sonra verilir.

**38.** Baş sözün mənalarının heç biri ilə uyğun gəlməyən, yaxud əksinə, mənalarının hamısı, ya da çoxu ilə əlaqədar olan frazeoloji vahidlər (hər mənada təkrar olunmamaq üçün), həmçinin idiomlar lüğət maddəsinin axırında ◊ işarəsindən sonra qısa izahla verilir.

*Qeyd.* Romb işarəsindən sonra gələn ifadələrdə, bir qayda olaraq, yalnız məcazi mənalar verilir; həqiqi mənaların izahı isə verilmir.

**39.** Tərkibə daxil olan sözlərdən biri sinonimlərlə ifadə edilə bilərsə, bunlar həmin sözdən sonra mötərizə içərisində verilir; məs.: *əldən* (*ayaqdan*) *düşmək, yoldan azmaq* (*çıxmaq*) və s.

**40.** Bir sözün altında çoxlu ifadə gələrsə, bunlar əlifba sırası ilə verilir.

## VII. İMLA VƏ VURĞU

**41.** Lüğətdə istər tərtibçinin mətni, istərsə də misallar (sitatlar) Azərbaycan dilinin mövcud orfoqrafiya qaydaları əsasında verilir.

**42.** Yazılış variantları (mövcud orfoqrafiyanın yol verdiyi variantlar) baş söz kimi, ayrıca öz əlifba sırasında, izah isə sözün ən çox işlənən variantında verilir.

**43.** Klassiklərin indiki nəşrlərində, habelə köhnə nəşrlərində bugünkü orfoqrafiya normaları ilə düz gəlməyən yazılış (imla) formaları olduqda, hər iki forma öz əlifba sırasında verilir, lakin köhnə imla ilə yazılmış sözün yanında, onun indiki imla ilə yazılmış formasına baxmaq lazım gəldiyi göstərilir; məsələn:

**HƏQQ** b a x **haqq**.
**NƏQŞ** b a x **naxış**.
**XƏLQ** b a x **xalq**.
**ƏVAM** b a x **avam**.

Misallar mümkün olduqca hər iki forma üçün verilir.

*Qeyd.* Lüğətdə bəzən klassiklərin əsərlərindən götürülmüş sitatlardakı bu və ya digər ərəb və ya fars sözünün imlası əslində olduğu kimi verildiyindən (xüsusən şeirdə), baş sözün imlası ilə düz gəlməyə bilər.

**44.** Köhnə orfoqrafiya ilə nəşr olunmuş, yaxud yazılmış məxəzlərdən götürülən sitatlar və misallar müasir orfoqrafiyaya uyğunlaşdırılır.

**45.** Sitatlarda durğu işarələri müasir qrammatikada qəbul edilmiş qaydalara uyğunlaşdırılır.

**46.** Bir qayda olaraq bütün əcnəbi (Avropa) sözlərdə, habelə vurğusunda fərq olan bəzi Azərbaycan və ya ərəb və fars sözlərində lazım gəldikdə vurğu qoyulur; məsələn:

**AKADЍMİK** Elmlər Akademiyasının həqiqi üzvü.
**AKADEMİ́K** *sif.* Akademiyaya aid olan.
**BARH***is.* [*fars.*] Hasar, divar, sədd.
**BБRI** *əd.* [*fars.*] Heç olmasa.

# ƏSAS MƏNBƏLƏR

“Azərbaycan dilinin izahlı lüğəti” yazılı mənbələr əsasında qurulmuşdur. Bu mənbələr aşağıdakılardan ibarətdir:

**1. İctimai-siyasi ədəbiyyat**: 1) Hökumət sənədləri (qərarlar və s.); 2) Azərbaycan dilində yazılmış ictimai-siyasi, iqtisadi və s. ədəbiyyat.

**2. Xüsusi vəsait:** 1) Azərbaycan dilinə aid bütün lüğətlər; 2) Azərbaycanca-rusca və rusca-azərbaycanca lüğətlər; 3) terminoloji lüğətlər; 4) Azərbaycan dilinin orfoqrafiya lüğəti; 5) Klassik Azərbaycan ədəbiyyatında işlənən ərəb və fars sözləri lüğəti; 6) Azərbaycan xalq şivələri lüğəti, Bakı, 1930-1931, 1 və 2-ci buraxılış (A və B hərfləri); 7) Şəmsəddin Sami, Qamusi-türki (2 cildlik), İstanbul, hicri 1317-1318-ci illər; 8) Axundov Saleh Quzanlı tərəfindən tərtib edilmiş Qarabağ şivələrinə aid lüğət, 1924-1929 (əlyazması).

**3. Bədii ədəbiyyat və folklor:** Görkəmli Azərbaycan yazıçılarının əsərləri və folklora aid çap olunmuş bütün əsərlər.

**4. Dövri mətbuat:** 1) 1920-ci illərə qədər olan mətbuat: “Əkinçi” qəzeti, “Molla Nəsrəddin” jurnalı; 2) sovet dövründə Azərbaycan dilində dərc olunmuş qəzetlər; jurnallar: “Azərbaycan” (“İnqilab və mədəniyyət”), “Azərbaycan məktəbi”, “Azərbaycan qadını”, “Kirpi” və s.

**5. Digər məxəzlər:** 1) orta və ali məktəblər üçün Azərbaycan dilində yazılmış orijinal, yaxud tərcümə edilmiş dərsliklər; 2) Azərbaycan Milli Elmlər Akademiyası M.Füzuli adına Əlyazmaları İnstitutunda saxlanılan kitablar, məcmuələr, qəzetlər, məktublar, sənədlər və s.; 3) Azərbaycan dilinin dialekt və şivələrinə aid materiallar (əlyazmaları); 4) Azərbaycan dilində nəşr olunmuş hər cür elmi-kütləvi kitablar; 5) memuar ədəbiyyatı (xatirələr) və s.

## LÜĞƏTDƏ GEDƏN İXTİSARLAR

"Az. kənd təs." – "Azərbaycan kənd təsərrüfatı" (jurn.)
"Az. qad." – "Azərbaycan qadını" (jurn.)
"Az. məkt." – "Azərbaycan məktəbi" (jurn.)
"Azərb." – "Azərbaycan" (jurn.)
"M. N. lətif." – "Molla Nəsrəddin lətifələri"
"Mol. Nəsr." – "Molla Nəsrəddin" (məcm.)
Ata. sözü – Atalar sözü
*aqr.* – aqronomiya
*alm.* – almanca
*anat.* – anatomiya
*antr.* – antropologiya
*arxeol.* – arxeologiya
*arxit.* – arxitektura
*astr.* – astronomiya
*av.* – aviasiya
*bağl.* – bağlayıcı
*bakt.* – bakteriologiya
*bayt.* – baytarlıq
*biol.* – biologiya
*bot.* – botanika
*cığat.* – cığatayca
*coğr.* – coğrafiya
*çin.* – çincə
*d.y.* – dəmiryol termini
*dan.* – danışıq dilində
*dəft.* – dəftərxana termini
*dəniz.* – dənizçilik
*dilç.* – dilçilik
*din.* – dini
*dipl.* – diplomatiya
*elektr.* – elektrotexnika
*etnoqr.* – etnoqrafiya
*əcz.* – əczaçılıq
*əd.* – ədat
*ədəb.* – ədəbiyyatşünaslıq
*ər.* – ərəbcə
*əvəz.* – əvəzlik
*f.bağ.* – feli bağlama
*f.is.* – feli isim
*f.sif.* – feli sifət
*f.* – feil
*fars.* – farsca
*fəls.* – fəlsəfə
*fiz.* – fizika
*fiziol.* – fiziologiya
*folk.* – folklor
*fot.* – fotoqrafiya
*fr.* – fransızca
*geod.* – geodeziya
*geol.* – geologiya
*hərb.* – hərbi termin
*holl.* – hollandca
*hüq.* – hüquqşünaslıq
[*xar.*] – xarici söz
*xəb.* – xəbər
*xüs.* – xüsusi termin
*xüs. is.* – xüsusi isim
*icb.* – icbar növ
*idm.* – idman
*iqtis.* – iqtisadi
*incəs.* – incəsənət
*ing.* – ingiliscə
*is.* – isim
*isp.* – ispanca
*isteh.* – istehza ilə
*ital.* – italyanca
*k.t.* – kənd təsərrüfatı
*kiç.* – kiçiltmə isim
*kin.* – kinayə ilə
*kit.* – kitab dilində işlənən söz
*klas.* – klassik ədəbiyyatda işlənən söz, ifadə
*köhn.* – köhnəlmiş söz
*qarş.* – qarşılıqlı feil
*qayıd.* – qayıdış feil
*qazax.* – qazaxca
*qəd.* – qədim söz
*qoş.* – qoşma
*lat.* – latınca
*mac.* – macarca
*mal.* – maliyyə işi
*malay.* – malayca
*mex.* – mexanika
*meteor.* – meteorologiya
*məc.* – məcazi mənada
*məch.* – məchul feil

*məd.* – mədən işləri
*məh*. – məhəlli söz
*məs.* – məsələn
*mətb.* – mətbəəçilik
*mif.* – mifologiya
*mikrob.* – mikrobiologiya
*miqd. s*. – miqdar sayı
*miner.* – mineralogiya
*monq.* – monqolca
*mus*. – musiqi
*mücər.* – mücərrəd forma
*müh*. – mühasibat
*müq. dər.* – müqayisə dərəcəsi
*nifr.* – nifrət forması
*oxş*. – oxşama
*opt*. – optika
*özb*. – özbəkcə
*paleon.* – paleontologiya
*pol*. – polyakca
*poliq.* – poliqrafiya
*psix.* – psixologiya
*rəs.* – rəsmi dildə işlənən söz
*rəss*. – rəssamlıq
*riyaz.* – riyaziyyat
*rus.* – rusca
*sanskr.* – sanskritcə
*sən*. – sənətşünaslıq
*sif.* – sifət
*sıra s.* – sıra sayı
*skand.* – Skandinaviya dilləri
*stat.* – statistika
*şahm*. – şahmat
*şair.* – şairanə söz
*tar.* – tarix termini
*tat.* – tatarca
*tex.* – texnika
*təql*. – təqlidi sözlər
*tənt*. – təntənəli söz
*tib.* – tibbi termin
*tic.* – ticarət termini
*t-li.* – təsirli feil
*toxuc.* – toxuculuq
*top.* – toplu isim
*t-siz.* – təsirsiz feil
*türk.* – Türkiyə türkcəsi
*ukr.* – ukraynaca
*uş.* – uşaq dilinə məxsus söz
*üst.* – üstünlük dərəcəsi
*vulq.* – vulqar (qaba söz)
*yəh*. – yəhudicə
*yun.* – yunanca
*zar.* – zarafatla
(z.) – zərf
*zool.* – zoologiya

## ƏSƏRLƏRİNDƏN SİTATLAR GƏTİRİLMİŞ ƏSAS MÜƏLLİFLƏRİN SİYAHISI

(*Əlifba sırası ilə*)

A.Bakıxanov
A.Divanbəyoğlu
A.Səhhət
A.Şaiq
Aşıq Abbas
Aşıq Ələsgər
Aşıq Pəri
B.Talıblı
B.Vahabzadə
C.Cabbarlı
C.Məmmədquluzadə
Çəmənzəminli (Yusif Vəzir)
Ə.Cavad
Ə.Cəmil
Ə.Əbülhəsən (Ələkbərzadə)
Ə.Haqverdiyev
Ə.Qəmküsar
Ə.Məmmədxanlı
Ə.Nəzmi
Ə.Sadıq
Ə.Vahid
Ə.Vəliyev
F.Köçərli
Füzuli
H.Cavid
H.K.Sanılı
H.Nəzərli
H.Sarabski
H.Zərdabi (Məlikov)
Heyran xanım
Həbibi
X.Natəvan
Xəstə Qasım
Xətayi
İ.Əfəndiyev
İ.Musabəyov
İ.Şıxlı
Kişvəri
Q.Zakir
Qantəmir (Qafar Əfəndizadə)
Qurbani
M.Arif (Dadaşzadə)
M.Dilbazi
M.Ə.Sabir
M.F.Axundzadə
M.Hadi
M.Hüseyn
M.İbrahimov
M.Möcüz
M.Müşfiq
M.P.Vaqif
M.Rahim
M.Rzaquluzadə
M.S.Ordubadi
M.Seyidzadə
M.V.Vidadi
Məsihi
Mir Cəlal
N.Nərimanov
N.Rəfibəyli
N.Vəzirov
Nəbati
Nəsimi
O.Sarıvəlli
R.Əfəndiyev
R.Rza
S.Ə.Şirvani
S.M.Qənizadə
S.Rəhimov
S.Rəhman
S.Rüstəm
S.S.Axundov
S.Vurğun
Sarı Aşıq
S.Hüseyn
T.Ş.Simurq
Ü.Hacıbəyov

## ŞƏRTİ İŞARƏLƏR

.. Sitatlarda ixtisarı bildirən işarə.

□ Məna ilə əlaqədar olan söz birləşmələrini izahdan ayıran işarə.

// Məna incəliklərini ayıran işarə.

◊ Frazeologiyanı (idiomatik ifadələri) ayıran işarə.

– Sitatları tərtibçi misallarından ayıran işarə.

## AZƏRBAYCAN ƏLİFBASI

| | | | | | | | |
|---|---|---|---|---|---|---|---|
| **A**<br>*a* | **B**<br>*be* | **C**<br>*ce* | **Ç**<br>*çe* | **D**<br>*de* | **E**<br>*e* | **Ə**<br>*ə* | **F**<br>*fe* |
| **G**<br>*ge* | **Ğ**<br>*ğe* | **H**<br>*he* | **X**<br>*xe* | **I**<br>*ı* | **İ**<br>*i* | **J**<br>*je* | **K**<br>*ke, ka* |
| **Q**<br>*qe* | **L**<br>*el* | **M**<br>*em* | **N**<br>*en* | **O**<br>*o* | **Ö**<br>*ö* | **P**<br>*pe* | **R**<br>*er* |
| **S**<br>*se* | **Ş**<br>*şe* | **T**<br>*te* | **U**<br>*u* | **Ü**<br>*ü* | **V**<br>*ve* | **Y**<br>*ye* | **Z**<br>*ze* |

# Aa

**A**[1] Azərbaycan əlifbasının birinci hərfi. *Həmin "a" sövtü millətlərin bəzisinin dilində çox işlənir, bəzisinin dilində az işlənir.* C.Məmmədquluzadə.

**A**[2] *nida.* 1. Sözlərə qoşularaq çağırış, xitab, müraciət bildirir. *A dostlar! A başına dönüm! A balam!* – [Murov:] *A kişi, mən səni üç gecədir axtarıram.* M.F.Axundzadə. *A quşlarım, getməyin; Məni qəmgin etməyin!* A.Səhhət. [Ağabacı:] *Nə eləyim, a Məşədi Püstə bacı! Kişi qocalıb yavaş-yavaş əldən düşür.* H.Sarabski. // Eyni mənada bəzən cümlənin ortasında işlənir. *Baxsanız a, beli çökmüş yamaca; Sinəsində şən quzular səslənir.* A.Şaiq. // Bəzən cümlənin axırında təkid bildirən ədat kimi işlənir. *Aparsan a!* – [İbrahim bəy:] *A kişi, çəkil kənara, görüm a!* Ə.Haqverdiyev.

2. İntonasiyadan asılı olaraq məmnunluq, hiddət, istehza, narazılıq, təəccüb və s. hissləri ifadə edir. *A! Sənə nə oldu? A, nə gözəl şeydir!* – [Ağa Mərdan:] *A, bu dabanıkəsik Heydərqulunun oğlu imiş!* M.F.Axundzadə. [Rübabə:] *A Böyükxanım, niyə gülməli söz danışırsan?!* Mir Cəlal.

3. Həyəcan, dəhşət, qorxu, peşmanlıq və s. hissləri ifadə edən səs (uzadılaraq xüsusi intonasiya ilə və bəzən təkrar şəklində işlənir). *Aaa, mən nə etdim! Aaa, bu necə adamdır! Aaa, nə böyük ilandır! – Yenə bir başqa xəbər varmı? – Bizim qonşu Kərim. – A... A... A? Bəli, hə, hə. – O nə qayırıb, de görüm.* M.Ə.Sabir.

4. Bəzən cümlənin axırında və ya sözdən sonra gələrək, təəccüb bildirir, yaxud danışılan sözə diqqəti cəlb edərək, onun haqqında düşündürmək üçün işlənir. *Bu paltoya yüz manat vermişəm; yüz manat a!*

**AB** *is.* [*fars.*] *klas.* 1. Su. ☐ **Abi-bəqa** – b a x **abi-həyat. Abi-heyvan(i)** – b a x **abi-həyat**. *Əzib ləli qatıb abi-heyvana; Qənd ilə yoğurub dil-dodaq çəkib.* Q.Zakir. **Abi-həyat** – həyat suyu, dirilik suyu (əfsanələrə görə, guya zülmətdə bir çeşmənin suyu olub, onu içənlər heç ölməzlərmiş). *Külli Qarabağın abi-həyatı; Nərmü nazik bayatıdır, bayatı.* M.V.Vidadi. *Ölümümdür mənim ol ruhi-rəvansız bu gecə; Gər içəm badeyi-gülgün yerinə abi-həyat.* S.Ə.Şirvani. *Abi-həyatın bir belə zahid ki, vəsf edər; Ləli-ləbin yanında bir əfsanədir mənə.* Ə.Vahid. **Abi-kövsər** – 1) dini əfsanələrə görə, guya cənnətdə olan Kövsər çayının dadlı suyu. *Dürlü bulaq abi-kövsər suyudur; İçəndə dad verir dəhanə, dağlar!* Aşıq Xəyyam. *Pəs onlar* [mollalar] *nə vaxtadək cənnət, abi-kövsər vədəsi ilə bədbəxt islam camaatının qanını soracaqlar?* C.Məmmədquluzadə; 2) danışıqda və ədəbiyyatda çox vaxt şərab həmin suya bənzədilir. [Süleyman bəy:] *Bəh-bəh, nə gözəl sudur! Xalis abi-kövsərdir!* Ə.Haqverdiyev. [Mirzə Turab:] *Sağ ol, Səfər ağa! Bu lap abi-kövsərdi.* B.Talıblı. **Abi-leysan** – b a x **abi-niysan. Abi-niysan** – bahar yağışı, çox güclü yağış. *Əmr olundu, abi-niysan; Cansızlara bəxş edə can; Yenə tazələndi dövran; Nə gözəl ruzigar oldu.* Q.Zakir. **Abi-niysan kimi** *məc.* – niysan yağışı kimi, sel kimi, çox güclü. *Biçarə çiyninə qoyub başını; Abi-niysan kimi tökür yaşını.* Q.Zakir. *Hacının qədim nökəri Kərbəlayı Qulaməli iranlı qapının ağzında ayaq üstündə gözlərinin yaşını abi-niysan kimi ağ saqqalından axıdırdı.* Ə.Haqverdiyev. **Abi-zəmzəm** (Zəmzəm – Məkkədə olan və suyu müsəlmanlar tərəfindən müqəddəs sayılan quyunun adıdır) – klassik poeziyada şərab mənasında işlənmişdir. **Abi-zindəgani** – b a x **abi-həyat**.

2. *məc.* Göz yaşı. *Bu səmavi gözü yağdırmada ab.* M.Hadi.

**ABA**[1] *is.* [*ər.*] *köhn.* Müsəlman ruhanilərinin və mömin adamların üstdən geydikləri qolsuz və ya gödəkqollu, yaxası açıq uzun kişi paltarı (əslində ərəb milli paltarıdır). *Kişi çıxardı ki, ağaya yüzlüklər bəxş edərdi; atlar, inəklər vəd edərdilər; ipək abalar, xəz cübbələr verilərdi.* Çəmənzəminli. *Çox vədə olurdu ki, həftənin iki ötər, üçüncü günü Molla Rəcəbi küçə ilə qayət qəmgin və ayaqları abasının ətəyinə dolaşa-dolaşa gedən görərsən...* B.Talıblı. *Molla nazik, ağ abasını çiyinlərində oynadaraq: – Buna heç şəkk-şübhə ola bilməz, – dedi.* S.Rəhimov.

**ABA²** *is. məh.* 1. Ata.

2. Böyük bacı (hörmət üçün böyük qadına da deyilir).

**ÁBA** *is.* [*ər.* "əb" söz. cəmi] Atalar, ata-baba. ☐ **Abavü əcdad** – ata-babalar, əcdad, nəsil, babalar. *Mərhum Mirzə Cəmal öz tarixində Pənah Əli xanın abavü əcdadı şənində belə yazır..* F.Köçərli.

**ABAD** *sif.* [*fars.*] 1. Müntəzəm və çoxlu tikintisi, yaşayış üçün hər cür şəraiti olan; şen. *Abad şəhər. Abad kənd. – Söylədiyimiz dövrdə İçərişəhər abad deyildi.* H.Sarabski. *Abad, gözəl şəhərimiz sülhün böyük dastanıdır.* N.Rəfibəyli. // Ümumiyyətlə, yaxşı, müntəzəm, səliqəli, mədəni, yaxud yaxşı təchiz və təmin olunmuş, yaxşı vəziyyətdə olan. ☐ **Abad edilmək** – b a x **abadlaşdırılmaq. Abad etmək (eləmək)** – b a x **abadlaşdırmaq**. *Zəhmət qoymaq, kəndlərimizi abad etmək, yaşayışımızı yaxşılaşdırmaq öz əlimizdədir.* T.Ş.Simurq. [Şair:] *Biz bu dünyaya xarabalıqları abad etməyə gəlmişik.* Ə.Məmmədxanlı. **Abad olmaq** – b a x **abadlaşmaq**. *Bunlar hərə öz məhəlləsinin abad olmağına cidd-cəhd etmişlər.* N.Nərimanov. *Tənimdə qalmayıb bir xali yer qəmzən xədəngindən; Olur abad hər mülkün ki, adil olsa sultanı.* Q.Zakir. **Abad olsun! Evin abad olsun!** – təşəkkür, razılıq, məmnuniyyət, təqdir bildirən ifadədir. *Etdi bir cam ilə təmir dili-viranı; Meyfüruşun görəyim xanəsi abad olsun!* S.Ə.Şirvani. [Qoca:] *Çörək verdin, yedim, evin abad olsun!* Ə.Haqverdiyev.

2. *məc. klas.* Şən, şad. *Dağıldı qüssədən abad gördüyün könlüm.* Heyran xanım.

**...abad** [*fars.*] Xüsusi isimlərə qoşularaq şəhər, kənd, yer adları düzəldilir; məs.: Cəlilabad, Sabirabad və s.

**ABADAN** b a x **abad**. *Abadan kənd tüstüsündən bəlli olur.* (Ata. sözü). ☐ **Evin abadan** – b a x **ev**.

**ABADANLANMAQ** b a x **abadanlaşmaq**.

**ABADANLAŞDIRILMA** "Abadanlaşdırılmaq"dan *f.is.*

**ABADANLAŞDIRILMAQ** b a x **abadlaşdırılmaq.**

**ABADANLAŞDIRMA** "Abadanlaşdırmaq"dan *f.is.*

**ABADANLAŞDIRMAQ** b a x **abadlaşdırmaq.**

**ABADANLAŞMA** "Abadanlaşmaq"dan *f.is.*

**ABADANLAŞMAQ** b a x **abadlaşmaq.**

**ABADANLIQ** *is.* 1. B a x **abadlıq.** *Hərə bir əl qoysa abadanlığa; Kəndimiz böyüyüb bir şəhər olar.* S.Vurğun. [Kəndlilər] *bir yerdə işləsinlər; .. hökumət bu işə kömək də edir, pul da buraxır, maşın da verir, abadanlıq üçün lazımi şeylər də buraxır.* T.Ş.Simurq.

2. Kənd, şəhər, yaşayış yeri, məskən. [Molla İbrahimxəlil:] *Məgər mən öz ixtiyarımla belə abadanlıqdan xaric, xəlvət guşəyə özümü çəkmişəm?* M.F.Axundzadə. ☐ **Abadanlıq salmaq** – məskən salmaq, yurd salmaq. *Bakının Məhəmmədli kəndindən köçərilər gəlib, bu məhəllənin cənub tərəfində abadanlıq salmışlar.* H.Sarabski.

3. B a x **avadanlıq** 1-ci mənada. [Gülcahan:] *Plov nədi, zad nədi?.. Sən də, qardaşım, abadanlıqdan danışırsan.* N.Vəzirov. *Ancaq mənə verilən üç otağın nə bir stolkürsüsü vardı ki, üstündə oturub yazı yazasan, nə də bir qeyri abadanlıq vardı.* C.Məmmədquluzadə.

**ABADLAŞDIRILMA** "Abadlaşdırılmaq"-dan *f.is.*

**ABADLAŞDIRILMAQ** *məch.* Abad edilmək, yaşayış üçün lazım olan hər cür şəraitlə təmin edilmək, yaxşı və mədəni hala salınmaq. *Dehlinin ətrafında çoxlu yeni evlər tikilmiş, şəhər xeyli abadlaşdırılmışdır.* M.İbrahimov.

**ABADLAŞDIRMA** "Abadlaşdırmaq"dan *f.is.*

**ABADLAŞDIRMAQ** "Abadlaşmaq"dan *icb.*

**ABADLAŞMA** "Abadlaşmaq"dan *f.is.*

**ABADLAŞMAQ** *f.* Abad olmaq, yaxşılaşmaq, yaşayış üçün lazım olan hər cür şəraitlə təmin olunmaq. *Kəndlərimiz abadlaşır.*

**ABADLIQ** *is.* 1. Hər hansı bir yerdə əhalinin yaşayışına lazım olan şərait və vəsait. *Şəhərin abadlığına çox diqqət yetirilir. – Bakıda gedən quruculuq və abadlıq işlərinin sürət və vüsətini rayon mərkəzlərinə köçürməliyik.* Ə.Vəliyev.

2. Abad yer, yaşayış yeri, yaşayış üçün yararlı yer; şenlik. *Ölkəmizin hər yeri abadlıqdır. – İnsan abadlıq, bayquş xarabalıq sevər.* (Ata. sözü). [Bədəl:] *Az keçər, qardaşlar, Pərviz xan xaraba qoyduğu yerlərdə abadlıq görərsiniz.* Ə.Haqverdiyev.

3. *məc. klas.* Ruh rahatlığı, dərdsizlik, qayğısızlıq mənasında. *Hiç rəng ilə mənə abadlıq mümkün deyil.* Füzuli.

**ABAJÚR** *is.* [*fr.*] Gözü işıqdan qorumaq üçün lampaya keçirilən örtük, qalpaq. *İpək abajur. Şüşə abajur. Süd rəngli abajur.*

**ABAJURLU** *sif.* Abajuru olan, üstü abajurla örtülü. *Abajurlu lampa.* – [Qadın] *sonra qolumdan tutub çəhrayı abajurlu elektrik çırağının altında durmuş ağ örtüklü stola tərəf çəkdi.* İ.Əfəndiyev.

**ABÁK** *is.* [*yun.*] 1. *arxit.* 1. Sütun başlığının dördbucaqlı şəklində olan yuxarı hissəsi.

2. Qədim yunanların və romalıların hesab lövhəsi.

**ABALI** *is. köhn.* Aba geymiş, əynində aba olan.

**ABASBƏYİ** *is.* Çox şirin, şirəli, ətirli yay armudu növü. *Armud növləri Azərbaycanda qədim zamanlardan bəri becərilir və hal-hazırda bir sıra .. nararmudu, abasbəyi, daşarmudu kimi yerli qiymətli armud sortları geniş becərilir.* H.Qədirov.

**AB(B)ASI** *is.* [*xüs. is.*-dən] 1. Dördşahılıq (iyimiqəpiklik) metal pul. *Cibimdə bir abbası pulum var*. – [Hacı Qara:] *Bu kasad bazarda mənim bir şahım yoxdur, abbasını haradan alıram*? M.F.Axundzadə.

2. *tar*. İranda Şah Abbas dövrünə aid sikkə (gümüş pul).

**AB(B)ASILIQ** *is. dan.* 1. B a x **ab(b)ası.** *Ab*(*b*)*asılığı xırdalamaq.*

2. İyirmi qəpik dəyərində olan, iyirmiqəpiklik. *İki abbasılıq marka aldım.* – [Bayraməli bəy:] *Axır sənin dədən də həmişə, bilirəm, kənddə səkkiz abbasılıq çay içir, sən niyə içməyəsən?* N.Vəzirov.

**ABBASİLƏR** *is. tar.* Bağdad xəlifələri sülaləsi (750-1258). *Harunərrəşiddən sonra abbasilərin istiqlaliyyət bünövrəsinə rəxnə düşdü.* A.Bakıxanov.

**ABCO** *is.* [*fars.*] Arpa suyu, pivə. [Mübaşir Məmməd:] *Sən öl, gecəni xoş keçirmək üçün abcodan yaxı şey yoxdur.* M.İbrahimov.

**ABDAL** [*ər.*] 1. *is.* Sərsəri, avara, dərbədər. *Gözəllərin olar xümsü zəkatı; Nə aşiqə, nə abdala yetişməz.* Aşıq Ələsgər. *Yetişdim bir kəndə eylədim sual; Qapı-qapı gedib olmuşam abdal.* Miskinli Məhəmməd. // Söyüş mənasında. [Oğuz:] *Baxınıb durma, haydı kisəni al! Gəl işim var səninlə, gəl, abdal!* H.Cavid. // *köhn.* Dərviş, qələndər. *Sufiyəm, əmma nə bu abdaldən; Haq sevən insanəm, a şirvanlılar!* M.Ə.Sabir.

2. *is. köhn.* Dərviş, qələndər.

**ABDALLAŞMAQ** *f.* Abdal olmaq, sərsəri olmaq.

**ABDALLIQ** *is.* Axmaqlıq, sərsərilik, səfillik.

**ABDAR** *sif.* [*fars.*] 1. Sulu, şirəli, təravətli, lətafətli. *Özündən oldu meyə bəzmdən kənar olmaq; Qələtdi bəhs ləbi-ləli-abdarınla.* Q.Zakir. *Nazənin qız .. yanaqları kimi qızarmış bir qızılgül dərib, şirmayı əli ilə abdar ləblərinə yaxınlaşdıraraq .. hovuz üstünə atılıb, qurulan kürsünün üstündə oturdu.* C.Cabbarlı.

2. *məc.* Mənalı, təsirli, gözəl ifadəli. *Abdar kəlam. Abdar söz. – Pəh-pəh, doğrudan da, zalım oğlunun necə abdar qələmi var.* C.Məmmədquluzadə.

3. *məc*. Möhkəm və iti. *Çox məni incitmə, tiği-abidarımdan saqın!* Füzuli. *Hinində daldalanma çox, həyətdə də dolanma çox; Yiyəndəki bıçağa bax, o tiği-abdarı gör!* M.Ə.Sabir.

**ABDARLIQ** *is.* Mənalılıq, parlaqlıq, gözəllik, təravət. *Kəlamın abdarlığı.*

**ABDƏST** b a x **dəstəmaz.** ◻ **Abdəst almaq** – dəstəmaz, namazdan qabaq əl-üzü yuma. *Abdəst almadan namaz qılmaq olmaz. – Qalın Oğuz bəgləri arı sudan abdəst aldılar.* "Dədə Qorqud".

**ABDƏSTXANA** [*fars.*] *köhn.* b a x **ayaqyolu.**

**ABDUQ** *is.* Su qatılmış qatıq; atılama, ayran.

**ABERRÁSİYA** *is.* [*lat.*] *fiziol.* 1. Həqiqətdən yayınma.

2. *məc.* Göz aldanması.

**ABGƏRDƏN** *is.* [*fars.*] Misdən, alüminiumdan və s.-dən qayrılmış uzunsaplı çömçə.

**ABGÜŞT** *is.* [*fars.*] *köhn.* Bozbaş, piti. *Məşədi getdi, abgüştü öz əlində buğlana-buğlana gətirdi..* C.Məmmədquluzadə. *Arvad abgüşt bişirmişdi. Gətirib qoydu kişinin qabağına.* Ə.Haqverdiyev.

**AB-HAVA, ABÜ HAVA** *is.* [*fars.* ab və *ər.* həva] Bir yerin, ölkənin iqlimi, təbiət (su, hava, isti-soyuqluq) cəhətdən vəziyyəti. *Firontək iddiayə düşsəm nə əcəb; Çox zövqlidir abü həvası Misrin.* S.Ə.Şirvani. [Şeyx Sənan:] *İştə Qafqaz! Səfalı bir məva; Allah, Allah, nədir bu abü həva!* H.Cavid.

**AB-HAVALI** *sif.* Yaxşı iqlimi olan, səfalı. *Təbiətcə zəngin, ab-havalı və sakit bir yerə getmək qərarına gələn Şamil də Araz ilə Günəşin olduğu həmin kəndə gəlib çıxdı.* A.Şaiq.

**ABXAZ** *is.* Abxaziyanın əsas əhalisini təşkil edən xalqın adı və bu xalqa mənsub adam. *Abxaz xalqı. Abxaz dili.*

**ABXOR** *is.* [*fars.*] *köhn.* Su içmək üçün qab, parç.

**ABI** *sif.* Açıq-göy, mavi rəngli. *Abı çit. Abı kağız. – Güləbətin köynək, abı nimtənə; Yaxasında qızıl düymə gərəkdir.* M.P.Vaqif. *Anladım ki, Gülbənd mənim abı mahud çuxama, çal papağıma işarə edir.* S.S.Axundov.

**ABIR** *is.* [*fars.*] 1. Həya, heysiyyət, şərəf, hörmət, qədir-qiymət. [Zibeydə:] *Axır mənim də özümə görə adım, abrım var!* M.F.Axundzadə. [Gövhər:] *İndiyədək abır, ismət saxladıb məni..* N.Vəzirov. [Birisi:] *Məgər mən öz abrımdan keçib camaat malına xəyanət edərdim?* Ə.Haqverdiyev.

2. *məc. dan.* Üst-baş, geyim, qiyafət, zahiri görünüş mənasında. [Qurban:] *Ə, bu nə paltardır, balam, heç bir utanıb qızarırsan? Bu abırla elə toya-vaya gedirsən.* S.Rəhimov.

3. *məc.* Bədənin məhrəm (örtülü, ayıb) yeri.

◊ **Abır gözləmək** – hörmət saxlamaq, ədəb gözləmək; utanmaq, həya etmək. **Abır qoymamaq** – 1) b a x **abrını almaq;** 2) xarab etmək, bərbad etmək, puç etmək. **Abırdan düşmək** – rüsvay olmaq, biabır olmaq, heysiyyətdən düşmək, şərəfini itirmək, ləyaqətini itirmək. **Abırdan salmaq** – hörmətsizlik etmək, biabır etmək, rüsvay etmək, bərk danlamaq. **Abra düşmək** – lazımi şəklə, qaydaya düşmək, ləyaqətli şəklə düşmək. **Abra salmaq** – səliqəyə salmaq, qaydaya salmaq. [Əlyarov:] *Heç olmasa gərək küçələri layiqincə bəzəyib abra salaq.* M.Hüseyn. **Abrı getmək (tökülmək)** – biabır olmaq, rüsvay olmaq, hörmətdən düşmək. [Yetər:] *Ağa, belə söhbətdən mənim abrım töküldü.* N.Vəzirov. **Abrını almaq** – bərk danlamaq, biabır etmək. [Qarabirçəyə] *elə gəlirdi ki, hər bir kəs Əbişin etdiyi cinayətə qarşı hiddətlənib onu yaxalayacaq, onun abrını alacaq..* S.Rəhimov. **Abrını aparmaq** – b a x **abrını almaq. Abrını atmaq** – özünü arsızlığa vurmaq, heç bir şeydən utanmamaq, abırsızlıq etmək. **Abrını ətəyinə bükmək** – bərk danlamaq, məzəmmət etmək, abrını almaq. **Abrını götürmək (tökmək)** – b a x **abrını almaq. Abrını vermək** – b a x **abrını almaq**.

**ABIR-HƏYA** *is.* b a x **abır** 1-ci mənada. ☐ **Abır-həyadan salmaq** – biabır etmək, rüsvay etmək. [Babacan:] ..*Yazıq Kamalı abır-həyadan salıb.* Ə.Əbülhəsən.

**ABIRLAMA** "Abırlamaq"dan *f.is.*; danlaq.

**ABIRLAMAQ** *f. dan.* Bərk danlamaq, abır vermək, töhmət etmək, məzəmmət etmək.

**ABIRLANMAQ** *f. dan.* 1. Bərk danlanmaq, töhmətlənmək, məzəmmətlənmək.

2. Layiqli bir şəkil almaq, düzəlmək, lazımi şəklə düşmək.

**ABIRLI** *sif.* 1. Həyalı, ismətli, utancaq, namuslu. *Abırlı qız. – Abırlı abrından qorxar, abırsız nədən qorxar?* (Ata. sözü).

2. *məc.* Etibarlı, hörmətli, nüfuzlu, ciddi. *Heyif ki, onun parlaq dövründə abırlı bir vəzir görmədik.* M.F.Axundzadə. [Müdir:] *Bax, mən görürəm ki, sən bir abırlı qoca kişisən, daha gəlib-getməkdən yoruldun.* Ə.Məmmədxanlı.

3. *məc. dan.* Yaxşı, münasib, səliqəli. *Abırlı geyim-kecim. Abırlı paltar.*

**ABIRSIZ** *sif.* Həyasız, utanmaz, ədəbsiz. *Abırsız adam.* // İs. mənasında. *Abırsızdan abrını saxla!* (Ata. sözü).

**ABIRSIZLIQ** *is.* Həyasızlıq, utanmazlıq, ədəbsizlik. [Tükəzbanı] *həyasızlıqda, abırsızlıqda ittiham edənlərin də sayı yavaş-yavaş azalırdı.* B.Talıblı.

**ABİD** *is.* [*ər.*] *din.* İbadətlə məşğul olan adam, vaxtını ibadətlə keçirən adam. *Hiç abid anmadı ləlin ki, gözdən qan töküb; Səcdədən durduqca təğyiri-müsəlla etmədi.* Füzuli. *Məscidləri ver zahidə, qoy xanəgahı abidə; Gəl sən, Nəbati, məskən et meyxanəni, meyxanəni.* Nəbati. [Oruc:] *..Bir abid peyda olub, bunun ismi-şərifi Şeyx Nəsrulladır.* C.Məmmədquluzadə.

**ABİDANƏ** *zərf* [*ər.* abid və *fars.* ...anə] Abid kimi, özünü abidə oxşadaraq.

**ABİDƏ** *is.* [*ər.*] 1. Tarixi əhəmiyyəti olan bir hadisəyə və ya tarixi bir şəxsə xatirə olaraq qoyulan nişangah, heykəl və s. *İndi Nizaminin qəbri üstündə 17 metr hündürlüyündə bir abidə yüksəlməkdədir.*

2. Qədim dövrlərə aid mədəniyyət əsəri. *Arxeoloji abidələr. Xalq yaradıcılığı abidələri. Yazılı abidələr. Qız qalası Azərbaycan maddi mədəniyyətinin ən qiymətli abidələrindəndir. – Bu meşəlik, qocaman ağaclar, qədim qalalar abidələrlə dolu idi.* S.Rəhimov.

3. *məc.* Yadigar. *Onu özüm çəkmişəm, haman şəkil mənim son sevgilimin unudulmaz abidəsidir.* M.S.Ordubadi.

**ABİDLƏŞMƏ** "Abidləşmək"dən *f.is.*

**ABİDLƏŞMƏK** *f. din.* Abid olmaq, daima ibadətlə məşğul olmaq, zahidləşmək, zahid həyatı keçirmək.

**ABİDLİK** *is. din.* İbadətlə məşğul olma, zahidlik.

**ABİOGÉNEZ** *is.* Canlıların cansız təbiətdən öz-özünə qəflətən törəməsi haqqında qədim, yanlış nəzəriyyə.

**ABİSİN** *is. tib.* Ürək qapaqlarının qüsuru zamanı işlədilən dərman preparatı.

**ABİSSÁL** *sif.* [*yun.*] Okeanın 2000 metrdən dərin hissəsi. *Abissal çöküntülər.*

**ABİTURİYÉNT** *is.* [*lat.*] Ali və ya orta ixtisas məktəbinə daxil olmaq istəyən şəxs.

**ABQORA** *is.* [*fars.*] Qora suyu, kal üzümün şirəsi.

**ABNOS, ABNUS** *is.* [*fars.*] Qara rəngli çox bərk oduncaqlı ağac. *Bir əlində abnus ağacından qara rəngli əsa olan bir müsafir pilləkənin başında göründü.* P.Makulu.

**ABOLİSİONÍZM** *is.* [*lat.*] ABŞ-da XVIII-XIX əsrlərdə zəncilər köləlikdən azad etmək hərəkatı.

**ABORDÁJ** *is.* [*fr.*] Yelkənli və avarlı gəmi donanması dövründə döyüş üsulu. *Abordaj çoxdan əhəmiyyətini itirib.*

**ABORİGÉN** *is.* [*lat.*] 1. Yerli, yerli mənşəli. *Aborigen və hibrid üzüm sortu.*

2. Ölkənin ilk yerli sakinlərinə verilən ad. *Avstraliya aborigenləri.*

**ABÓRT** *is.* [*lat.*] *tib.* Hamiləliyin təbii və ya süni surətdə dayandırılması.

**ABORTÍV** *is.* [*lat.*] 1. Hər hansı bir prosesin inkişafının dayanması.

2. *tib.* Xəstəliyin gedişini dayandıran və sürətli müalicə üçün istifadə olunan dərmanlar. *Abortiv dərmanlar.*

**ABPAŞ** *is.* [*fars.*] *köhn.* Ağzı süzgəcli alət; susəpən, suçiləyən.

**ABRÁZİYA** *is.* [*lat.*] Dalğaların sahilboyu süxurları ovması. *Abraziyanın sürəti.*

**ABREVİATÚRA** [*ital.*] *dilç.* Sözün baş hərflərini və ya hissələrini saxlamaqla düzəldilmiş mürəkkəb qısaltmalar. ABŞ (Amerika Birləşmiş Ştatları), Univermaq (Universal maqazin).

**ABRİZ** *is.* [*fars.*] *köhn.* Çirkli su tökülən yer, çirkab yeri. // Ayaqyolu.

**ABRU** *is.* [*fars.*] B a x **abır**. [Mirzə Əsgər:] *Saqqal deyəndə kişinin abrusudur və üzünün nurudur.* N.Vəzirov. *Yaman yoldaş səbəbinə insan min bəlaya düçar olar, abrusu əlindən gedər, xalq arasında bədnam olar.* Ə.Haqverdiyev.

**ABSENTEÍZM** *is.* [*lat.*] Seçkilərdə iştirak etməkdən kütləvi imtina, boyun qaçırma. *Absenteizmə yol verməmək.*

**ABSÉS** *is.* [*lat.*] İltihab nəticəsində yaranmış irin topası. *Xronik abses tədricən inkişaf edir.*

**ABSOLYÚT** *is.* [*lat.* absolutus – şərtsiz] *fəls.* b a x **mütləq** 3-cü mənada.

**ABSÓRBSİYA** *is.* [*lat.*] Mayenin qaz qarışığından hər hansı bir maddəni udması prosesi. *Xüsusi absorbsiya qurğuları.*

**ABSTİNÉNSİYA** *is.* [*lat.*] 1. Spirtli içkilərdən çəkinmə.

2. Fiziki və psixi hal.

**ABSTRÁKSİYA** *is.* [*lat.* abstractio – ayırma, təcridetmə] *fəls*. 1. B a x **təcrid**.

2. İnsan təfəkkürünün abstraktlaşma fəaliyyəti nəticəsində hasil olan mücərrəd

məfhum, yaxud ümumi nəzəri nəticə. *Elmi abstraksiya. Abstraksiya obyektiv aləmi dərketmə prosesində zəruri pillədir.*

**ABSTRÁKT** *sif.* [*lat.* abstractio – mücərrədləşmə] Konkret varlıqla əlaqəsi olmayan; mücərrəd (*konkret* əksi). *Abstrakt anlayış. Abstrakt mühakimə.*

**ABSTRAKTLAŞDIRILMA** "Abstraktlaşdırılmaq"dan *f.is.*

**ABSTRAKTLAŞDIRILMAQ** *məch.* Mücərrədləşdirilmək, mücərrəd məfhumlar yaradılmaq; məntiqi olaraq konkret, ayrı-ayrı əşyadan ümumi məfhumlara və inkişaf qanunlarına keçilmək.

**ABSTRAKTLAŞDIRMA** "Abstraktlaşdırmaq"dan *f.is.*

**ABSTRAKTLAŞDIRMAQ** *f.* Mücərrədləşdirmək, mücərrəd məfhumlar yaratmaq; məntiqi olaraq konkret, ayrı-ayrı əşyadan ümumi məfhumlara və inkişaf qanunlarına keçmək; bir şeyi onun ikinci dərəcəli əlamətlərindən sərf-nəzər edərək tədqiq etmək.

**ABSTRAKTLAŞMA** "Abstraktlaşmaq"dan *f.is.*

**ABSTRAKTLAŞMAQ** b a x **mücərrədləşmək.**

**ABSURD** *is.* [*lat.*] Boş və mənasız söz-söhbət, cəfəngiyat.

**ABULÍYA** *is.* [*yun.*] *tib.* İradəsizlik, patoloji iradə zəifliyi.

**ABUNƏ** *is.* [əsli *fr.*] Abonement haqqını ödəməklə kütləvi informasiya vasitələrinə əvvəlcədən yazılma. *Abunə şöbəsi. Abunə qəbulu. Abunə vərəqəsi. – Amma bircə şey qaldı ki, mən onu başa düşmürəm: bilmirəm abunə pullarını sevgili "Rəhbər" harada saxlamaq istəyir.* C.Məmmədquluzadə.

**ABUNƏÇİ** *is.* Abunəsi olan adam, abunə yazılan adam. *Qəzet və məcmuələrin abunəçiləri gündən-günə artır. Abunəçilərin siyahısı.*

**ÁBZAS** [*alm.*] 1. Sətirbaşı. *Abzasdan başlamaq. Abzasdan oxumaq. Müxtəlif abzasların yerli-yerində olmasına fikir verilməli.*

2. Mətnin bir sətirbaşından o biri sətirbaşına qədər olan hissəsi. *Birinci abzası oxumaq. Redaktor məqalənin ikinci abzasını atdı.*

**AC** *sif.* 1. Aclıq hiss edən, yeməyə ehtiyacı olan (*tox* ziddi). *Ac pişik. Ac* (z.) *qalmaq. – Ac qurd balasını yeyər.* (Ata. sözü). *Çığırma, yat, ay ac toyuq, yuxunda çoxca darı gör!* M.Ə.Sabir. □ **Ac qarın** – 1) ac, heç şey yeməmiş; 2) *məc.* lüt, yoxsul, yurdsuz-yuvasız mənasında. **Ac qoymaq** – 1) yemək verməmək, yeməksiz-içməksiz qoymaq; 2) *məc.* gəlir mənbəyini kəsmək. **Ac qurd** *məc.* – son dərəcə ac, doymaq bilməyən, acgöz, qarınqulu. **Ac saxlamaq** – pis saxlamaq, lazımınca (doyunca) yemək verməmək. **Acından öldürmək** – tamamilə ac saxlamaq, heç yemək verməmək. **Acından ölmək** – 1) son dərəcə yoxsulluq çəkmək, çox aclıq çəkmək nəticəsində ölmək; 2) *məc.* fövqəladə aclıq hiss etmək, yemək istəmək. // İs. mənasında. *Acları yedirtmək.* // Aclıq ifadə edən. *Ac gözləri ilə ona baxdı.*

2. *məc.* Son dərəcə yoxsul, kasıb, fağır, möhtac. *Ac ölkə. Kəndlilərin çoxu ac idi.*

3. *məc.* Tamahkar, həris, gözüdoymaz.

4. Quraqlıqdan susamış. *Ac torpaq.*

**AC-ACINA** *zərf* Heç bir şey yemədən, tamamilə ac halda, boş qarına. *Ac-acına yola çıxmaq. – Biçarə Məşədi Əsgər indi üç gün idi ki, gözüyaşlı, ac-acına balalarının əhvalına alışırdı.* S.M.Qənizadə.

**ACAR** *is.* Cənubi Qafqazda yaşayan xalqlardan birinin adı, həmin xalqa mənsub olan adam. *Acar ədəbiyyatı.*

**ACDIRAN** *f.sif.* İştahaçan, yaxşı yedirən.

**ACDIRMA** "Acdırmaq"dan *f.is.*

**ACDIRMAQ** *icb.* Acmasına səbəb olmaq, aclıq hissi oyatmaq. *Yol adamı acdırır.*

**ACGÖDƏN** *sif. dan.* Çoxyeyən, doymaq bilməyən.

**ACGÖZ(LÜ)** *sif.* Tamahkar, heç şeydən gözü doymayan. *Acgöz adam. Acgöz pişik. – Acgöz mədənçilər quyu qazıldıqca yanlarını bərkitmədiklərindən çox zaman quyu uçur, qazmaçılar altında qalır*(*dı*). A.Şaiq. // İs. mənasında. *Acgözün qarnı doymaz.* // Ehtiraslı, həris.

**ACGÖZLÜK** *is.* 1. Tamahkarlıq, gözüdoymazlıq, hərislik. *Acgözlük etmək. – Əfruz bacı pərdə altında asdığı paltarların sayını-hesabını dolaşdırdığı halda, yenə də paltar əhvalatında həmin acgözlüyündə qalmışdı.* S.Rəhimov.

2. *məc.* Çox böyük maraq, ehtiras, həvəs. *Acgözlüklə* (z.) *musiqiyə qulaq asmaq*.

**ACI** *sif.* 1. Dili-ağzı yandırıcı, kinə, xardal və s. dadında olan (*şirin* ziddi). *Acı dərman. Acı badam. Acı dad. Acı istiot. Acı turp. Acı soğan. Acı çay* (dişləmə çay, içinə qənd salınmamış çay).

2. *məc.* Fəlakətli, məşəqqətli, əziyyətli, kədərlə dolu. *Acı həyat. Acı tale. Acı günlər.* // *is. məc.* (çox vaxt cəm şəklində). Fəlakət, əziyyət, məşəqqət, təzyiq. *İndi Gülpəri, ona* [İdrisə] *çox məşəqqətli keçmiş uşaqlıq həyatının bütün acılarını unutdurdu.* M.Hüseyn. ☐ **Acı çəkmək** – müsibət çəkmək, fəlakət keçirmək.

3. *is. məc.* Ağrı, azar, yorğunluq hissi. *Can acısı. – Molla Bağırın fələqqəsinin çubuqlarının acısını, deyəsən, indi bu saat yenə ayaqlarımda hiss edirəm.* C.Məmmədquluzadə. // Müvəffəqiyyətsizlik, uğursuzluq, fəlakət, peşmanlıq nəticəsində doğan acılıq hissi. [Ulduzun] *duyduğu acını yuyub aparmaq üçün heç bir göz yaşı kifayət deyildi.* Ə.Məmmədxanlı.

4. *məc.* Xoşa gəlməyən, qəlbə toxunan, ağır, pis, qaba, kobud. *Acı söz. Acı danışıq. Acı xatirələr. – Şol şəkər dildən rəvamıdır, şəha; Bən mühibbə sən acı söz söyləmək?* Nəsimi. [Səfdərqulu:] *Mümkün deyil ki, kişi səni görə, sənə acı söz deməyə.* N.Vəzirov. *Ayrım qızı .. naxır sahiblərinin acı töhmətini eşitməmək, həm də Kərim babaya acı dərs vermək qəsdi ilə yumrubaşlı iri çomağı götürüb özünü naxıra yetirmişdi.* A.Şaiq. ☐ **Acı danışmaq** – b a x **acılamaq.**

5. *məc.* İbrətli, nəticəsi pis olan, təəssüf ediləcək. *Keçən ilin acı təcrübəsindən hələ də lazımi nəticə çıxarmamışlar.*

6. Bəzi sözlərin qabağında, onların ifadə etdikləri şeyin təsirini, dərəcəsini, qüvvəsini şiddətləndirir. *Şərbətli acı firqətin nuş edərəm şəkər kimi.* Nəsimi. *Əsəndə dövranın acı ruzgarı; Saralıb solursan bir gözəl kimi.* S.Vurğun. *Acı xəzri qurutmuş torpağını, daşını.* R.Rza. *Heybət əlini Şamonun əlindən üzərək, ata acı bir qamçı çəkdi.* S.Rəhimov. *Gəlin bayaq acı bir fəryad çəkib özündən getdi.* Mir Cəlal.

◊ **Acı göz yaşları** – dərdin, kədərin şiddətini ifadə edir. **Acı gülüş** – dərin bir kədərlə birləşmiş gülüş, ağlarkən gülmə. **Acısını almaq (çıxarmaq)** – 1) heyfini almaq, intiqamını almaq; 2) acılığını azaltmaq (götürmək).

**acı-acı** *zərf* 1) Nifrətlə, acıqla, ələ salarcasına, istehza ilə, başqasına toxunacaq, təhqir edəcək bir tərzdə. *Acı-acı gülmək. Acı-acı danışmaq. Acı-acı baxmaq*; 2) təəssüflə, qəlbi yana-yana, məyusluqla. *Səfər .. qanına bulaşıb zarıldayan yaralıları və meyitləri seyr edir, nə isə acı-acı düşünürdü.* Çəmənzəminli. *O, insanlardakı vəfasızlığa acı-acı gülürdü.* M.Hüseyn. *Acı-acı gülərdin, indi şirin-şirin gül.* S.Rüstəm.

**ACIBALDIRĞAN** *is. bot.* Rütubətli yerlərdə bitən zəhərli ot bitkisi.

**ACIBİYAN** *is. bot.* Çoxillik alkaloidli bitki.

**ACICA** *sif.* 1. Bir qədər acı, azca acı, acıtəhər.

2. Çox acı.

**ACIÇİÇƏK** *is. bot.* Dağlıq yerlərdə, otlaqlarda bitən zəhərli ot.

**ACIDİL(Lİ)** *sif.* Danışarkən hamısını sancan, acı söz deyən. *Acıdil adam. – Qoca bağban sərt təbiətli, acıdil, əsəbi və daima savaşan arıq bir kişi idi.* M.Hüseyn. [O] *qorxurdu ki, bu acıdil arvadda yeməyə bir loğma da çörək olmaya*! Ə.Əbülhəsən.

**ACIDİLLİ(Lİ)K** *mücər.* Danışarkən hamını sancmaq, acılamaq, zəhərləmək xasiyyəti.

**ACIXƏMRƏ** *is.* Xəmir mayası, acıtma.

**ACIİSTİOT** b a x **bibər**.

**ACIQ** *is.* Hirs, hiddət, qeyz, qəzəb. *Acığın cana ziyanı var*. (Ata. sözü). [Əziz bəy:] *Bir güzgüyə bax, gör gözlərin acığından qan çanağına dönübdür*. M.F.Axundzadə. *İçərimdə zəhərli ilan kimi bir acıq və kin qıvrılırdı*. M.İbrahimov. *Cəmil .. güləndə acığından Tahirin əlləri titrəməyə başladı*. M.Hüseyn. ☐ **Acığa düşmək** – tərslik etmək, inad etmək. *Nəsrəddin bu hadisələrdən acığa düşdü.* M.S.Ordubadi. **Acığa salmaq** – öz hərəkəti, ya sözü ilə birisinin tərslik etməsinə, inad etməsinə səbəb olmaq. **Acığı soyumaq (yatmaq)** – hiddəti keçmək, qəzəbi keçmək, sakitləşmək. *Qaraca qız anladı ki, ağıllı köpək onu bir*

*tövr ölümdən qurtarmışdır. Ona görə də dərhal acığı yatdı və qara köpəyin başını sığallayıb onu əzizlədi.* S.S.Axundov. **Acığı tutmaq** – hirslənmək, hiddətlənmək, qəzəblənmək. *Uşaqlar içində düşər gülüşmək; Sənin də acığın tutar, ağlarsan.* M.V.Vidadi. *Bilmədim kimə acığım tutsun və kimin üstünə hirslənim.* C.Məmmədquluzadə. *Qaraca qız .. düşünürdü: – Mən Ağca xanıma nə etdim ki, anasının mənə acığı tutdu.* S.S.Axundov. [Qulunun] *bütün məzlum, zavallı görkəmi Surxayda təzadlı bir duyğu oyandırdı: bir yandan ona yazığı gələrdi, ürəyi yanardı, o biri yandan da acığı tutardı.* M.İbrahimov. **Acığı(na) gəlmək** – xoşlamamaq, xoşlanmamaq, xoşuna gəlməmək. [Qənbərqulu:] *..Mən özüm əslində az danışan adamam, heç çox danışmağı sevmirəm və çox danışan adamlardan da acığım gəlir.* B.Talıblı. *Daha artıq böyüdükcə, onun* [Azadın] *bu xasiyyəti mənim acığıma gəlməyə başlayırdı.* M.İbrahimov. *Həbib fikirləşdikcə özündən acığı gəlirdi.* Ə.Vəliyev. **Acığını basmaq (yemək)** – özünü saxlamaq, hiddətini yatırmaq. **Acığını çıxarmaq** – heyfini almaq, əvəzini çıxmaq. *İndi Molla Kərim orucluğun və məhərrəmliyin də acığını çıxarmaq istəyirdi.* B.Talıblı. **Acığını tutdurmaq** – hirsləndirmək, acıqlandırmaq. *Yay girəndə Səmədin dəliliyi şiddətlənirdi. Görürdün, yol gedəndə gözləri çanağından çıxıb oynayır, .. acığını tutduranı döyməmiş olmurdu.* Çəmənzəminli. **Acıq almaq** – intiqam almaq, əvəzini çıxarmaq, heyfini almaq. **Acıq çəkmək** – arzu edilməyən, xoşa getməyən səbəblər üzündən hirslənmək, acıqlanmaq, daxili iztirab çəkmək. **Acıq çıxartmaq (çıxmaq)** – b a x **acıq almaq**. **Acıq eləmək** – küsmək, inciyib getmək. **Acıq vermək** – birini acıqlandırmaq, birisinin acıq çəkməsinə səbəb olmaq. [Topçular:] – *Boşa gedəcək, nə qədər atsanız boşa gedəcək! – deyə uzaqdan-uzağa düşmənə acıq verirdilər.* Ə.Əbülhəsən. – [Ağca xanım] *pərdəni salmaq, sakitcə evə girməklə Zoyaya acıq vermək, "yandırmaq" istəyirdi.* Mir Cəlal.

**acıqla** *zərf* 1) Acıqlı bir surətdə, hiddətlə, hirslə. *Acıqla cavab vermək. Acıqla danışmaq;* 2) qəsdən, tərsinə olaraq. *Acıqla etmək. O, acıqla belə elədi.*

**ACIQARPIZ** *is. bot.* Gövdəsi yerlə sürünən çoxillik bitki (dərman bitkisi). [Acıqarpız] *3-5 qanadlı girdə yarpaqlara malikdir; sarı rəngli böyük çiçəkləri tək-tək yerləşmişdir.* R.Əliyev.

**ACIQDIRMAQ** *f.* 1. Ac qoymaq.

2. İştaha gətirmək, iştaha gətirməsinə səbəb olmaq. *Aclıq hissi doğurmaq.*

**ACIQICI** *is. bot.* Vəzəriyə, tərəyə oxşar yeməli bir bitki. *..Tellinin süfrəsi salınmışdı. Çörəklə bərabər vəzəri və acıqıcı da qoyulmuşdu.* Çəmənzəminli.

**ACIQ-QICIQ** *is. dan.* Birisini acıqlandırmaq, hiddətləndirmək. *Acıq-qıcıq vermək.*

**ACIQLANDIRMA** "Acıqlandırmaq"dan *f.is.*

**ACIQLANDIRMAQ** *icb.* Acığını tutdurmaq; öz hərəkəti, sözü və s. ilə birinin hirslənməsinə, acıqlanmasına səbəb olmaq. *Dünən uşaqlar məni bərk acıqlandırmışdılar. Adamı bu qədər acıqlandırmazlar.*

**ACIQLANMA** "Acıqlanmaq"dan *f.is.*

**ACIQLANMAQ** *f.* 1. Acığı tutmaq, hirslənmək, hiddətlənmək, qızmaq. *Hər şey üçün adam acıqlanmaz. Niyə belə acıqlanmısan? – Nəbi bərk acıqlanmışdı. Boz atın ağzını geri qaytarıb, naçalnikin qoşununa təpindi.* "Qacaq Nəbi". *Nina mənim Sərdar Rəşidlə söhbətimi gördüyündən yenə də acıqlandı.* M.S.Ordubadi. *Tez-tez ayağı sürüşdüyündən isə* [Qarakişi] *daha da acıqlanırdı.* Ə.Əbülhəsən.

2. Birinin üstünə qışqırmaq, məzəmmət etmək, danlamaq. *Atası oğluna acıqlandı.*

**ACIQLI** *sif.* 1. Hirsli, hiddətli, qəzəbli. Acıqlı adam. *Acıqlı nəzər. Acıqlı söz. Acıqlı cavab. – Acıqlı başda ağıl olmaz.* (Ata. sözü). // Zərf mənasında. *Acıqlı baxmaq. Acıqlı cavab vermək. Acıqlı danışmaq. – Səlim bəzən kəskin və acıqlı, bəzən həyasız bir tonla cavab verirdi.* M.İbrahimov. *Ata-anası onun* [Sitarənin] *sözünü kəsib acıqlı deyirdilər: – Kəs səsini, bihəya! Namusumuzu yerə soxdun.* Çəmənzəminli.

2. *məc.* Şiddətli, coşqun, dəhşətli və s. mənalarda. *Acıqlı dəniz. Acıqlı külək.*

**acıqlı-acıqlı** *zərf* Acıqlı halda, hirsli-hirsli. *Mexanik acıqlı-acıqlı* [fəhlələrə] *baxaraq, həyət qapısından çıxıb .. getdi.* H.Nəzərli. *Qoca acıqlı-acıqlı ona* [Surxaya] *baxdı*. M.İbrahimov. [Səadət xanım] *üzüklü barmaqları ilə məni yanıyaraq acıqlı-acıqlı baxırdı.* Mir Cəlal.

**ACIQLILIQ** *is.* Acıqlı adamın halı, vəziyyəti, xassəsi, hirslilik.

**ACIQMAQ** *f.* 1. B a x **acmaq**.

2. *məh*. Yoxsullaşmaq, kasıblaşmaq, əli aşağı düşmək.

**ACIQOVUQ** *is. bot.* Zəncirotu, qabsındıran (çoxillik ot).

**ACIQOVUN** *is. bot.* Çoxillik dərman bitkisi. *Acıqovun düyünlü köklərə malikdir, bitkinin adətən yerüstü gövdəsi yoxdur, lakin yarpaqlar çılpaq və neştər şəklində, kənarı isə kəsik-kəsikdir*. R.Əliyev

**ACILAMA** “Acılamaq”dan *f.is.*

**ACILAMAQ** *f.* Acı sözlər demək, zəhərləmək, sancmaq, birinə acı söz deyib qəlbini incitmək. [Zeynal:] – *Sən istədiyin qədər bağır! – deyə qocanı acılayırdı*. A.Şaiq. [Kor seyid] *bəzi vaxt Məsməni nalayiq sözlər ilə acılarmış.* S.Hüseyn. *Sarxan dəstənin ortasında durmuşdu. Onu yenə də acılayırdılar*. M.Hüseyn.

**ACILANMAQ** *mәch.* Acı sözlərlə pərt edilmək, qəlbi sındırılmaq, acı sözlər deyilmək.

**ACILAŞDIRILMA** “Acılaşdırılmaq”dan *f.is.*

**ACILAŞDIRILMAQ** *məch*. Acı edilmək, dadı acı bir hala gətirilmək.

**ACILAŞDIRMA** “Acılaşdırmaq”dan *f.is.*

**ACILAŞDIRMAQ** *f.* Acı eləmək, dadını acı hala gətirmək. *İstiot xörəyi acılaşdırdı. Bibər ağzımı acılaşdırdı.*

**ACILAŞMA** “Acılaşmaq”dan *f.is.*

**ACILAŞMAQ** *f.* Acı olmaq, dadı tündləşmək, dadı xarab olmaq. *Yağın duzu az olduğuna görə acılaşıbdır. İstidən kərə çox tez acılaşır.*

**ACILATMAQ** b a x **acılaşdırmaq.**

**ACILI** *sif.* Zəhərli, ağılı. *Qoca arvad kişi ilə acılı ilan kimi dik qalxdılar..* A.Divanbəyoğlu.

**ACILICA** *is. bot.* Bəzi növlərindən dərman hasil edilən çoxillik ot bitkisi.

**ACILIQ** *is*. 1. Acı şeyin halı; acı dadma. *Ağız acılığı. Yağın bir az acılığı var. Ağzımda acılıq var.*

2. *məc*. (bəzən cəm şəklində işlənir). Uğursuzluq, fəlakət, məşəqqət və s. nəticəsində doğan acı hiss. [Təliə:] *Bəlkə də şair məni bu günün acılıqlarını dadızdırmaq üçün ölümdən qurtardı*. M.S.Ordubadi. *Qadının üzünü bir acılıq bürüdü. Qaşları çatıldı*. S.Hüseyn. [Koxa:] *Axı acılıq bir il gedər, töhmət min il.* S.Rəhimov.

3. *məc*. Kəskinlik, kinayəlilik. *Kəyan Mahmudun gözlərinə baxdığı vaxt ancaq onun sözlərindəki acılığı duydu.* Ə.Əbülhəsən.

4. *məc*. Pislik, kəskinlik, sərtlik. *Zəmi yerini bürüyən havanın acılığı Alo kişinin zəhləsini tökürdü.* S.Rəhimov.

**ACILIQOTU** *is. bot.* Yarpaqsız, buğumlu, gövdəsi qol-budaqlı kiçik kol bitki. [Acılıotunun] *gövdəsi düz, qismən odunlaşmış və boz rəngli budaqları vardır*. R.Əliyev

**ACIMA¹** “Acımaq¹”dan *f.is.*

**ACIMA²** “Acımaq²”dan *f.is.*

**ACIMAQ¹** *f.* 1. Acı olmaq, acı dad vermək, acılaşmaq, tündləşmək.

2. Turşumaq, qıcqırmaq, yetişmək. *Xəmir acımışdır.*

3. *dan.* Acıqlanmaq, hirslənmək. *..Qəssab Şamil ilə barışıb öpüşsə də, sabah, ya biri gün bir yavan ət üstə yenə acıyıb küsəcəkdir*. C.Məmmədquluzadə.

**ACIMAQ²** *f.* 1. Yazığı gəlmək, ürəyi yanmaq, rəhmi gəlmək; mərhəmətə gəlmək. *Mən yazıq qızın vəziyyətinə həddindən artıq acıdım*. M.S.Ordubadi. *Səməd ustaya acıdı və səyini qiymətləndirərək maaşını .. artırdı*. M.İbrahimov.

2. Təəssüf etmək, heyifsilənmək. *İtirdiyim vaxta acıyıram. Səninlə görüşə bilmədiyimə acıyıram. – Bəzən Qədirin nitqinə ehtiyac qalmazdı. O dilxor olar, əməyinə acıyardı.* Mir Cəlal.

**ACIMIŞ** *f.sif.* Turşumuş, qıcqırmış, yetişmiş. *Acımış xəmir.*

**ACIMSOV, ACIMTIL, ACIMTRAQ** b a x **acıtəhər.**

**ACIMTILLIQ, ACIMTRAQLIQ** *is*. Acımtraq şeyin halı, az acılıq.

**ACINACAQ(LI)** *sif.* Acımalı, rəhm edilməli, mərhəmətə layiq; kədər doğuran; bədbəxt, miskin. *Acınacaq vəziyyət. Acınacaq bir mənzərə. Acınacaqlı vəziyyət. Acınacaqlı həyat. – Acınacaqlı bir hala salınmış heyvanların döşünü-başını ovuşdura-ovuşdura birtəhər təkrar döyüşə cəlb etmək istərdilər*. H.Sarabski.

**ACINDIRICI** b a x **acınacaq(lı)**.

**ACINDIRMAQ** *f.* Təəssüf doğurmaq, şəfqət doğurmaq.

**ACINMAQ** b a x **acımaq**[1] 3-cü mənada. *Əsədin .. öz günahını yenə də düşünməməyinə* [müəllim] *acınıb dodaqlarını çeynəyərək şəhadət barmağını ona tərəf silkələyib hədələdi*. B.Talıblı.

**ACIŞDIRICI** *sif.* Göynədici, gicişdirici. *Mərmi və mina ilə dağım-dağım olan yerin bağrından barıt iyi verən boğaz və göz acışdırıcı tüstülər qalxırdı.* Ə.Əbülhəsən.

**ACIŞDIRMA** "Acışdırmaq"dan *f.is.*

**ACIŞDIRMAQ** *f.* 1. Ağrıyan bir yeri, yaranı qaşımaqla, dərman qoymaqla qıcıqlandırmaq. *Yaranı acışdırmaq*. – *Adamların burnunu və boğazını acışdıran kəsif çürüntü iyi ətrafı bürümüşdü*. P.Makulu. // Göynətmək, ağrıtmaq.

2. Acığını tutdurmaq, acıqlandırmaq, hirsləndirmək.

**ACIŞMA** "Acışmaq"dan *f.is.*

**ACIŞMAQ** *f.* Göynəmək, ağrımaq, gicişmək, qıcıqlanmaq. *İsmayılzadə dodaqları arasındakı papirosun tüstüsündən acışan gözünü qıyıb, o biri gözü ilə altdan yuxarı Fikrətə baxırdı*. M.Hüseyn. *Professor bu dəfə də dəsmalı ilə acışan gözlərini sildi*. S.Rəhimov.

**ACITƏHƏR** *sif.* Bir az acı, bir qədər acı, acı dadan.

**ACITMA** *is*. Xəmir mayası, acıxəmrə. *Xəmirə acıtma qatmaq*.

**ACITMAQ[1]** *f.* 1. Acı etmək, acılaşdırmaq. *Çox saxlamaqdan yağı acıtmışlar.*

2. Turşutmaq, qıcqırtmaq. *Xəmiri acıtmaq.*

**ACITMAQ[2]** *f.* İncitmək, acığını tutdurmaq. *Sözüm onu acıtdı.* – *Acıtdı məni acı sözün, tünd nigahın.* Füzuli. *Yalnız Mahmudu acıdan bu idi ki, .. arvadı üzünün dörddən biri və yaxud yarısını göstərməyi əvəzinə, çarşabı lap çiyninə atıb başını tamamilə açmışdı.* B.Talıblı. [Qaçayın] *qaşqabağı, sallaq dodağı, çatılan qaşı, qırışıq alnı müəllimi lap acıtdı.* Ə.Vəliyev.

**ACITMALI** *sif.* Acıtma vurulmuş, acıtma qatılmış, acıtması olan. *Acıtmalı xəmir.*

**ACITMALIQ** *sif.* Acıtma üçün olan, acıtmaya yarar. *Acıtmalıq xəmir.*

**ACIYONCA** *is. bot.* Çəmənlərdə, meşə kənarlarında bitən çoxillik bitki.

**ACIYOVŞAN** *is. bot.* Meşə kənarlarında otlu yamaclarda bitən dərman bitkisi.

**ACİZ** *sif.* [*ər.*] 1. Əlindən iş gəlməyən, bacarıqsız, zəif. *Aciz uşaq. Aciz adam. O çox aciz adamdır. – Bizim söhbətimizə gəldikdə, tələbə Əbdülhəsənzadə Xəlil, necə ki axırda məlum oldu, heç də aciz deyilmiş.* C.Məmmədquluzadə. // Nə edəcəyini bilməyən, çaşıb qalmış. *Mən bu işdə acizəm.* – [Hacı Kərim:] *Mən ki zərgərəm, yövmiyyə xərcimdən ötrü acizəm.* M.F.Axundzadə. ☐ **Aciz etmək** – iqtidarsız etmək, bacarmaz hala gətirmək, son dərəcə zəif salmaq. *Xəstəlik onu lap aciz edib.* **Aciz qalmaq, aciz olmaq** – bir iş görmək iqtidarından məhrum olmaq, bacarmamaq. *Olsun aləmlərə hökmün nafiz; Qalsın əmrində təbiət aciz.* A.Səhhət. *Murovlar, pristavlar, naçalniklər, hətta qubernatorun özü onun* [Əbdülkərimin] *əlində aciz qalıb, öhdəsindən gələ bilmirdilər.* Ə.Haqverdiyev. [Yusif:] *Bu zorbalıqda ayı mənim qamçımın qorxusundan hər cür oyun çıxarır, amma bu balacalıqda qızın əlində aciz qalmışam.* S.S.Axundov. *Çox zaman qəşəng söz deməyi bacaran adamlar çətin hallarda qəhrəmanlıq göstərməkdən aciz olurlar.* M.Hüseyn.

2. Cəsarətsiz, qətiyyətsiz, qorxaq. *Aciz adam.* // İs. mənasında. [Heydər bəy:] *Əlbəttə, acizləri həmişə tuturlar. Malını alıb tənbih edirlər.* M.F.Axundzadə. // Yazıq, fağır, məzlum, əlsiz-ayaqsız. [Fəxrəddin:] *İlan insanları ehtiyatsızlığa sövq etmək üçün özünü aciz göstərir.* M.S.Ordubadi.

**ACİZANƏ** *zərf* [*ər.* aciz və *fars.* ...anə] 1. Acizcəsinə, aciz bir halda.

2. Nəzakət bildirən köhnəlmiş ifadə – həqiranə. *Acizanə boyun əyərək. Acizanə xahiş etmək.* – [Güləsərin] *..baxışlarında aci-*

*zanə yalvarışla bahəm dərin bir məzəmmət, dil anlamaz, mərhəmətsiz bir adama qarşı coşan kin qarışıq giley-güzar var idi.* İ.Şıxlı.

**ACİZLƏŞDİRMƏ** "Acizləşdirmək"dən *f.is.*

**ACİZLƏŞDİRMƏK** *f.* Acizləşməsinə səbəb olmaq, aciz etmək.

**ACİZLƏŞMƏ** "Acizləşmək"dən *f.is.*

**ACİZLƏŞMƏK** *f.* Getdikcə aciz olmaq, bacarığını, iqtidarını itirmək, daha əlindən iş gəlməmək. *Xəstələnəndən sonra lap acizləşmişdir.*

**ACİZLİK** *is.* Bacarıqsızlıq, iqtidarsızlıq, zəiflik, cəsarətsizlik, qətiyyətsizlik. *İşdə acizlik. Onun bütün müvəffəqiyyətsizliyi acizliyindən doğur.* – [Nizami:] *Ümidsiz olmaq acizlikdir, insan yer üzünə səadət üçün gəlir.* M.Hüseyn. ☐ **Acizlik göstərmək (etmək)** – qorxmaq, cəsarət etməmək. [Cahandar ağa] *arvadının qarşısında acizlik edəcəyini duyduğundan, yönünü çevirdi və getmək istədi.* İ.Şıxlı.

**ACQARINA** *zərf* b a x **ac-acına**. *Acqarına papiros çəkmək zərərdir. – Acqarına bir nəfər nəğmə oxurmu məgər?* A.Səhhət.

**ACLIQ** *is.* 1. Yeməyə ehtiyac hissi. *Səhərdən aclıq hiss edirəm.* // Uzun müddət doyunca yeməmə. *Aclıqdan tələf olmaq.* – [Şahbaz bəy:] *Adam aclığından, susuzluğundan oğurluğa, quldurluğa qurşanar.* M.F.Axundzadə. *Uşaqlar da aclıqdan çıxıb, evdə çörək pulu olduğuna şadlanırlardı.* S.M.Qənizadə. ☐ **Aclıq çəkmək** – uzun müddət doyunca yeməmək, qarnı tox olmamaq. [Dərviş] *o qədər arıq və cansız idi ki, qabırğalarını bir-bir saymaq olardı və əlbəttə ki, çox aclıq çəkmiş bir adam bu hala düşə bilərdi.* Ə.Məmmədxanlı.

2. Məhsulsuzluq və ya başqa bir ictimai fəlakət nəticəsində əmələ gələn qıtlıq, qəhətlik, ərzaq yoxluğu. *Aclıq ili. – Başqa yerdən də taxıl gəlmədiyi üçün aclıq ölkəni ağzına almışdı.* Çəmənzəminli. ☐ **Aclıq düşmək** – məhsulsuzluq və ya başqa bir ictimai fəlakət nəticəsində məhsul qıtlığı.

3. *məc.* Ümumiyyətlə, qıtlıq, hər hansı istehlak şeylərinin azlığı, çatışmaması, tapılmaması. *Əmtəə aclığı.*

4. *məh.* Təzə taxıldan birinci dəfə üyüdülən un, döyülən xırman.

◊ **Aclıq elan etmək** – özünə və ya başqalarına edilən haqsızlığa etiraz əlaməti olaraq şəxs(lər)in yeməkdən imtina etməsi. *Sərhəng sual etdi: – Onun aclıq elan etdiyi neçə gün olar?* M.İbrahimov.

**ACMA** "Acmaq"dan *f.is.*

**ACMAQ** *f.* Aclıq hiss etmək, yemək istəmək. *Bu bulağın suyunu içən kimi adam acır.*

**AC-SUSUZ** *zərf* Heç bir şey yemədən, acqarına, tamamilə ac halda. [Hacı Murad:] *Ac-susuz altı saatdır o tacirin, bu tacirin dükanının qabağını kəsdirib borc yığıram.* S.S.Axundov. *Neçə gün meşədə ac-susuz qalan Xanməmməd təsadüfən tapılır və yarımcan halda qalaya gətirilir.* Çəmənzəminli.

**AC-YALAVAC** *is.* və *sif.* Ac, heç bir şeyi olmayan, yoxsul, dilənçi, səfil. [Azyaşlı uşaqlar] *ac-yalavac, dilənçi günündə yaşayır, gecə-gündüz insan qüvvəsindən xaric işləyirdilər.* H.Sarabski. ☐ **Ac-yalavac qoymaq** – hər şeydən məhrum etmək, var-yoxunu əlindən almaq, müflis etmək, dilənçi halına salmaq. [Ramazan:] *Mən yazığın da var-yoxunu cürbəcür hiylə ilə əlimdən* [Səfər] *aldı, məni ac-yalavac qoyub, bu günə saldı.* B.Talıblı.

**...açan** Bəzi sözlərə qoşularaq mürəkkəb sifət düzəldilir; məs.: könülaçan, ürəkaçan, gözaçan, iştahaçan.

**AÇAR** *is.* 1. Qıfılı açmaq və ya bağlamaq aləti. *Qapı açarı. Stolun açarı. Şkaf açarı. – Sən də açılmamış bir dəfinəsən; Açarı qeyb olan bir xəzinəsən.* M.Müşfiq. // Məc. mənada. *Beş dənizin açarı indi əlimizdədir.* Ə.Cəmil.

2. Canlı dildə bəzən "qıfıl" mənasında da işlənir. *Açarın dili sınıbdır. Qapının açarını aç.*

3. Çilingərlikdə işlədilən müxtəlif ölçülü alətlər. // Elektrik cərəyanını açıb bağlamaq üçün alət. *Elektrik açarı.* // Saat və s. mexanizmləri qurmaq üçün alət.

4. *xüs.* Şifrlə yazılmış bir mətni oxumaq üçün xüsusi şəkildə düzəldilmiş hərflər sistemi. *Şifrin açarını tapmaq.* // *məc*. Çeşidli problem və məsələlərin həlli yolu. *Məsələnin açarını tapmaq. – Bilik xəzinəsinə kitabdır qızıl açar.* M.Seyidzadə.

5. *filol.* Çətin bir mətni yaxşı başa düşmək, üçün sadə şəkildə şərh edilmiş yazı.

*Nizami əsərlərinin açarı. Firuzabadi qamusunun açarı.*

6. *mus*. Not sətirlərinin əvvəlində notların mənasını müəyyən edən işarə. *Skripka açarı.*

◊ **Açar salmaq** – 1) oğurluq məqsədi ilə özgənin qapısını açmaq; 2) *məc*. birinin qəlbini, ürək sirrini bilmək üçün onu sınamaq; yoxlamaq.

**AÇARÇI** *is.* 1. Açar qayıran, qıfıl, açar ustası, çilingər.

2. Mədənlərdə və s.-də mexanizmləri bağlayan fəhlə. [Ramazan:] *İndi elə vaxt deyil ki, buruq ustası olmaq üçün otuz-qırx il külüng çalasan, .. bu gün şagirdsən, sabah açarçı olacaqsan.* M.Hüseyn. [Həmid] *indi açarçı vəzifəsində işləyirdi.* Ə.Məmmədxanlı.

3. Həbsxana qapılarının açarlarını saxlayan, onları açıb bağlayan xidmətçi.

**AÇARÇILIQ** *is.* Açarçı sənəti, işi.

**AÇARLI** *sif.* 1. Açarı olan. *Açarlı saat. Açarlı qıfıl.*

2. Canlı dildə bəzən "qıfıllı, qıfılla bağlı" mənasında işlənir. *Qapı açarlıdır.*

**AÇDIRMA** "Açdırmaq"dan *f.is.*

**AÇDIRMAQ** *icb.* Açmağa məcbur etmək. *Alınan məktubu anası güc ilə Rüxsarəyə açdırdı.* S.Rəhimov.

**AÇIQ** *sif.* 1. Qapalı olmayan, örtülü olmayan. *Açıq pəncərə. Açıq qutu. Açıq kitab. – Səhər Sona yuxudan ayılıb medalyonu açıq* (z.) *gördü.* N.Nərimanov. // Qıfılsız, bağlı olmayan. *Açıq şkaf. Açıq qapı.*

2. Örtüksüz, üstü örtülü olmayan, damı olmayan. *Açıq səhnə. Açıq avtomobil. Açıq kinoteatr. Açıq balkon.* □ **Açıq havada** – qapalı bina xaricində. *Yığıncaqdan sonra artistlər açıq havada konsert verdilər.* S.Rüstəm.

3. Heç bir tərəfdən məhdud olmayan, geniş, vüsətli. *Açıq səhra. Açıq dəniz. Açıq tarla. – Qayıq dəniz buruqlarının böyründən şütüyərək açıq dənizə çıxdı.* M.Hüseyn. // Hasarı, hüdudu olmayan. *Açıq həyət. Açıq meydan.*

4. Sərbəst, maneəsiz, heç bir şeylə məhdud olmayan. *Açıq yol. Açıq satış. Açıq müzayidə.* // Zərf mənasında. [Humay] *ta çocuqluqdan bəzən açıq və sərbəst olaraq böyümüşdür.* H.Cavid.

5. Buludsuz, aydın, təmiz, tutqun olmayan. *Açıq hava.* – [Keşikçilər] *açıq səmanın fonunda xırdaca qarışqalara bənzəyirdilər.* İ.Şıxlı.

6. *is*. Açıqlıq, boşluq, meydan. *Şəhərin ortasındakı açıqda bağ salınmışdır. – Qalın qara meşənin ortasındakı açığı; Buludlu göydən işıqlandırır Ayın işığı.* A.Səhhət.

7. Rəngi tünd, tutqun olmayan, zəif. *Açıq çay. Açıq məhlul. Açıq paltar. Açıq rəng. Açıq ton.*

8. Sahibsiz, boş, heç kəs tərəfindən tutulmamış (vəzifə, yer). *İdarəmizdə üç açıq yer var.* □ **Açıq qalmaq** – boş qalmaq, tutulmamaq.

9. Müdafiəsiz, hücuma məruz qala bilən. *Cəbhənin açıq yerlərinə qüvvə göndərmək.* // Müdafiə edilməyən, möhkəmləndirilməyən, istehkamsız, qeyri-hərbi. *Açıq liman. Açıq şəhər.*

10. Çılpaq, üryan, örtüsüz. *Açıq baş. Açıq döş. Açıq qol. – Qüdrətin qulağının dibindən tutmuş açıq boynuna qədər qırmızı bir zolaq uzanır.* M.İbrahimov.

11. Hamı üçün sərbəst olan, gizli olmayan. *Açıq iclas. – Sən amansız olmalısan, – deyə Əlyarov əlinin hərəkəti ilə sözünün təsirini gücləndirmək istədi, – onların hamısını açıq məhkəmə eləmək lazımdır.* M.Hüseyn.

12. Səmimiyyət ifadə edən, səmimi. *Açıq adam. Açıq söhbət. Açıq ürək. // Zərf mənasında.* Heç bir şeyi gizlətmədən, heç bir şeydən çəkinmədən. [Fərhad:] *Siz mənimlə açıq danışın; mən də sizin kimi bir adamam; nə qədər açıq danışsanız, bir elə mən sizdən razı olaram.* Ə.Haqverdiyev. [Gəldiyev] *Verdiyevin söhbətə ayrı rəng verdiyini görüb açıq danışa bilmədi.* Mir Cəlal. □ **Açıq adam** – gülərüzlü, safqəlbli. **Açıq olmaq** – səmimi olmaq, fikrini gizlətməmək. **Açıq ürəklə** – səmimiyyətlə, sədaqətlə. [Dilaranın anası] *buna görə də qızını yola salarkən, açıq ürəklə Həsəni evə gətirməyi ona tapşırırdı.* M.İbrahimov. **Arası açıq olmaq** – yaxın olmaq, aralarında rəsmi münasibət olmamaq. *Onunla aramız açıqdır. – Saday onu yaxşı tanısa da, araları bir o qədər açıq deyildir.* M.Hüseyn.

13. Aşkar, bəlli, aydın, heç bir şeylə gizlədilə bilməyən; şübhəsiz. *Açıq düşmənçilik. Açıq ədavət. Açıq mübarizə. Açıq yalan.*

14. *məc.* Aydın anlaşılan, məntiqli. *Açıq fikir. Açıq ifadə. Açıq sübut.* – [Sabirin] *yazdığı şeirlərin çoxu açıq və sadə ana dilində olub məişətimizin eynini göstərməyə görə əzbər öyrənilirdi.* F.Köçərli. // Qabaqcıl, mütərəqqi. *Tələbələrdən Qurban Mərəndi adlı birisi öz açıq fikirləri və cəsarətli hərəkətləri ilə Firidunun diqqətini cəlb etmişdi.* M.İbrahimov.

◊ **Açıq əl** *məc.* – səxavət, comərdlik. **Açıq gözlə baxmaq** (**etmək, getmək** və b.k.) – məqsədi, vəzifəni başa düşərək, aydın anlayaraq; şüurlu surətdə. [Zaman:] *O da istəməzmi ki, açıq gözü ilə dünya işığına baxsın?* Ə.Haqverdiyev. **Açıq qapı** – qonaqpərəstlik, mehmannəvazlıq, müsafirpərəstlik mənasında. *Hacı Kamyabın qapısı hər gələn üçün açıq idi*. Ə.Haqverdiyev. **Açıq qapı günü** – ali məktəbə, işə girmək istəyənlərin məktəb və sənaye müəssisəsi ilə tanış olmaları üçün ayrılan gün. **Açıq məktub** – 1) poçt kartoçkası; 2) birisinə xitabən qəzet və ya məcmuədə dərc edilən məktub və s. **Açıq seçki** – açıq səsvermə üsulu ilə keçirilən seçki. **Açıq səsvermə** – gizli olmayıb, adətən əl qaldırmaqla səsvermə üsulu. **Açıq sifət** – qəmgin olmayan, şad mənasında. **Açıq tamaşa** – hər kəsin gələ biləcəyi tamaşa; biletsiz, müftə tamaşa. **Açıq yara –** hələ sağalmamış yara.

**açıq...** Mürəkkəb rəng adlarının qabağına gətirilərək, onların tünd, qəliz olmadığını, açığa çaldığını göstərir; məs.: açıq-abı, açıq-bənövşəyi, açıq-qırmızı, açıq-sarı, açıq-çəhrayı, açıq-yaşıl və s.

**AÇIQ-AÇIĞINA** *zərf* Açıq bir surətdə, gizlətmədən, qorxmadan, çəkinmədən. *Lakin Əhməd pəncərələrə tərəf nə üçün baxdığını açıq-açığına Cəmiləyə deyə bilmirdi.* S.Rəhimov.

**AÇIQ-AŞKAR** b a x **açıq-aydın**. *Ölümsüzdür açıq-aşkar açılan güllə; Qara həsəd gizli-gizli yeyir ürəyi.* B.Vahabzadə.

**AÇIQ-AYDIN** *zərf* və *sif.* b a x **açıq** (12-13-cü mənalarda). *Açıq-aydın məsələ. Fikrini açıq-aydın söyləmək. Açıq-aydın danışmaq. – Dostumuzun açıq-aydın baxışlarından; Mavi suya nur tökülür, mənalar yağır.* S.Vurğun.

**AÇIQCA** 1. *zərf* Açıq-aydın bir surətdə, gizlətmədən, qorxmadan, çəkinmədən. *Fikrini açıqca söyləmək. Məqsədini açıqca anlatmaq. Səhvlərini açıqca boynuna almaq.* – *Əsgər və Əlyar Rüxsarə haqqında, öz aralarında açıq söhbət etdikləri və açıqca danışdıqları halda, Xudakərəm özünü o yerə qoymurdu.* S.Rəhimov.

2. *sif.* Bir az açıq, açıqtəhər.

**AÇIQCASINA** b a x **açıqca**.

**AÇIQDAN** *zərf* Aydın surətdə, aşkar surətdə, gizlətmədən. *Açıqdan ədavət bəsləmək. Fikrini açıqdan söyləmək.*

**AÇIQDAN-AÇIĞA** b a x **açıq-açığına**. *Eyiblərini açıqdan-açığa söyləmək. Açıqdan-açığa düşmənçilik etmək. Açıqdan-açığa yalan danışır.* – [Məsmə] *kimsəyə əl açmayacağını, kimsədən bir şey dilənməyəcəyini açıqdan-açığa kor seyidə bildirir.* S.Hüseyn. *Tökür hicrində açıqdan-açığa göz yaşını.* S.Rüstəm.

**AÇIQFİKİRLİ** *sif.* Azad düşünən, düzgün düşünən, sağlam fikirli; dünyagörüşü mütərəqqi olan. *Doktorun oğlu darülfünun son kursunda oxuyurdu. O, zəkalı, açıqfikirli və cəsarətli bir adam idi.* M.İbrahimov. *Mirzə Hüseyn də .. açıqfikirli adamlardandı.* S.Rəhman.

**AÇIQFİKİRLİLİK** *is.* Açıqfikirli adamın xassəsi, sağlam fikirlilik, düzgün düşünən, görüşdə qabaqcıllıq, tərəqqipərvərlik.

**AÇIQGƏZƏN** *sif.* Çadrasız, çadra örtməyən. [Bəşir] *..dediyini yenə də deyir: mən oxumuş, açıqgəzən azərbaycanlı qızı alacağam.* S.S.Axundov.

**AÇIQGÖZ(LÜ)** *sif.* Ayıq, sağlam düşünən, hər şeyi olduğu kimi görən, gözüaçıq. *Açıqgözlü adam.*

**AÇIQGÖZLÜLÜK** *is.* Sağlam düşünmə, hər şeyə açıq gözlə baxma xassəsi; gözüaçıqlıq, ayıqlıq.

**AÇIQLIQ** *is*. 1. Açıq yer, düzəngah, açıq sahə, meydan. *Açıqlıqda çadır qurmaq. Uşaqlar açıqlıqda top-top oynayırlar.* – [Maro] *meşədə xeyli dolandıqdan sonra, meşənin dərinliyində alaçıq böyüklüyündə*

*açıqlıq tapdı.* S.Rəhimov. // Tikintisiz yer, açıq yer, boş yer. *Məktəbin dalı açıqlıqdır. Açıqlıqda binalar tikilmişdir. –* [Toğrul] *açıqlıqdan keçdi, kömür kimi qara və müzlim görünən qamışlığa girdi.* H.Nəzərli.

2. İki şey arasındakı boşluq, aralıq, məsafə. *Yol ilə arx arasındakı açıqlıqda ağaclar əkilmişdir. Kisələri açıqlığa qoy. – Fasilə etibarı ilə bunların arasındakı açıqlıq bir o qədər deyildi.* S.Hüseyn.

3. Aydınlıq, təmizlik, buludsuzluq. *Havanın açıqlığı. Göy üzünün açıqlığı.*

4. Açıq, örtüsüz, qapalı olmayan şeyin halı.

5. *məc.* Səmimilik, ürəyiaçıqlıq, qəlbini gizlətməmə. [Mahmud] *təbiətinə xas bir açıqlıq və rayihə ilə bizi heyran etmişdi.* M.İbrahimov. [Rüxsarə] *indi tənhadır, indi artıq Rüxsarə ilə tam açıqlığı ilə danışa bilərdi.* S.Rəhimov.

◊ **Açıqlığa çıxmaq** *məc.* – sıxıntıdan, əziyyətdən qurtarmaq, dərddən, qəmdən xilas olmaq, xoş günə çıxmaq.

**AÇIQRAQ** *sif. köhn.* Daha açıq. // Bir qədər açıq, azacıq açıq.

**AÇIQRƏNGLİ** b a x **açıq** 7-ci mənada. *Açıqrəngli paltar. Açıqrəngli boya. Açıqrəngli mürəkkəb. Açıqrəngli çit.*

**AÇIQ-SAÇIQ** *sif.* və *zərf* 1. Pərişan, nizamsız, dağınıq.

2. Açıq, ədəb xaricində, hər şeyi olduğu kimi, öz adı ilə. *Açıq-saçıq danışmaq.*

**AÇIQÜRƏKLİ** *sif.* Səmimi, öz fikrini ürəyində gizlətməyən, ürəyiaçıq. *Açıqürəkli adam.*

**AÇIQÜRƏKLİLİK** *mücər.* Açıqürəkli adamın xassəsi; səmimiyyət, ürəyiaçıqlıq.

**AÇILACAQ** *is.* 1. Ev qapısının içəriyə tərəf açılan yeri.

2. Düyümün və ya bağlı bir şeyin açılma yeri.

3. *məc.* Bir məsələnin, müəmmanın həlli, açarı.

**AÇILAN** *is. məh.* Atəş açan silah, odlu silah (tüfəng, tapança). [Heydər] *də neçə gündür ki yoxdur, xəbər gəzir ki, o, açılan axtarır.* S.Rəhimov.

**...açılan** Saylara qoşularaq, tüfəng, tapança növlərini bildirir; məs.: beşaçılan, onaçılan.

**AÇILIŞ** *is.* Açılmaq işi, açılma vaxtı; başlanış. *İclasın açılışı. Sərginin açılışı.*

**AÇILIŞMA** "Açılışmaq"dan *f.is.*

**AÇILIŞMAQ** *f.* 1. *qarş.* Bir-birinə yaxın olmaq, məhrəmləşmək, bir-birinə isinişmək, yaxınlaşmaq. [Əhməd:] *Birdən Gülnazı bərk-bərk qucaqlayıb öpdüm, bu əhvalat bizim açılışmağımıza səbəb oldu.* T.Ş.Simurq.

2. Daha utanmamaq, sıxılmamaq, özünü sərbəst hiss etmək; tədricən mühitə, ətrafdakılara, şəraitə alışmaq. *Usta Ağabala əvvəl bir utandı, sonra isə yavaş-yavaş açılışdı.* Çəmənzəminli. *Qarnı doymuş və rəngi özünə gəlmiş uşaqlar həyətdə oynayır, getdikcə şadlanıb açılışırdılar.* M.İbrahimov.

3. Həyasızlaşmaq, daha çəkinməmək, sırtıqlaşmaq, əl-qol açmaq.

4. İnkişaf etmək, kamilləşmək, zehni açılmaq, irəliləmək. *Uşaq məktəbə gedəndən xeyli açılışıbdır.*

**AÇILMA** "Açılmaq"dan *f.is.*

**AÇILMAQ** *f.* 1. Qapağı, örtüsü və s. götürülmək, düşmək, açıq hala gəlmək. *Qutu açıldı. Qazanın qapağı açıldı. Damın üstü açıldı. Şüşənin ağzı açıldı. Qıfıl açıldı.*

2. Aradakı maneə götürülmək, yaxud yox olmaq. *Qarlar əridi, dağ kəndlərinə yol açıldı.* // Tayları, layları açıq hala gəlmək. *Küləkdən pəncərələr açıldı. – Dalanda ayaq səsi eşidildi, dərhal evin qapısı zərblə açıldı.* Mir Cəlal.

3. Qatlanmış, bükülmüş, düyünlənmiş, bağlanmış şeyin qatları, bükükləri, qırışıqları düzəltmək, düyünü, bağı açıq hala gəlmək. *Çətirin düyməsini basan kimi açıldı. Bağlama yerə düşüb açıldı. Örpəyi açılıb başından düşdü. Gəminin yelkənləri açıldı. Belindən qayış açıldı. Boğazından qalstuk açılıb düşdü. Lent açıldı. Ayaqqabıların qaytanı açıldı.*

4. Qoşqudan azad edilmək (olmaq). *Atlar arabadan açıldı. Öküzlər kotandan açılıb otlayırlar.*

5. Aralanmaq, seyrəklənmək, arada məsafə əmələ gəlmək. *Səflər açıldı.*

6. Aralanmaq (qapalı, yumulu şey). *Gözləri açılmaq. Ağzı açılmaq. – Ah, o gözlər ki, nigahilə dilü didələrim; Açılırdı, daha bir də məni şad etməyəcək.* A.Səhhət.

7. Başlanmaq. *İşə başlamaq. İclas saat üçdə açıldı. Məruzədən sonra müzakirə açıldı. İdarələr yayda saat 8-də açılır. Məktəblərin açılmasına lap az qalmışdır.*

8. Təsis olunmaq, əsası qoyulmaq; tətbiqə, işləməyə başlamaq. *Son illər ölkəmizdə çox sayda yeni məktəblər açılmışdır. Yeni dəmiryol xətti açıldı.*

9. Yaranmaq, əmələ gəlmək, mümkün olmaq. *Yeni mədən yataqlarının tapılması nəticəsində bu yerlərin inkişafı üçün böyük imkanlar açılmışdır. Azərbaycan incəsənəti qarşısında böyük perspektivlər açılmışdır.*

10. İfşa edilmək, meydana çıxarılmaq. *Cinayətin üstü açıldı.* – [Divanbəyi:] *Quldurların izi açılıbdır. Mən onları tutmağa çarə taparam...* M.F.Axundzadə. // Aydın olmaq, aşkar olmaq, bəlli olmaq, məlum olmaq. [Bayram:] *Yox, çuğulluq peşəsini üstümə götürmərəm, iş özü özbaşına açılar.* M.F.Axundzadə. [Piri baba:] *Siz, Həcər xanım, tez gedin, burada olmağınız açılmasın.* S.S.Axundov. // Üzə çıxmaq, büruzə vermək, görünmək (xəstəlik və s.).

11. Tədqiqat, araşdırma və s. nəticəsində kəşf olunmaq, müəyyən edilmək. *Maqnit hadisələrinin mahiyyəti ancaq XIX əsrin əvvəllərində açıla bilmişdir.*

12. Çiçəklənmək, yarpaqlanmaq; görünmək, zahir olmaq. *Yaz gəldi, güllər açıldı. – Gül ilə həmzəban olubdu bülbül; Açılıb bənövşə, yasəmən, sünbül.* Q.Zakir. *Açılmış güllər, göy, sarı zanbaqlar; Bir cənnətdir bu gülşən hər tərəfli.* A.Səhhət. *Seyrəltmədən və kultivasiyadan sonra .. pambıq daha yaxşı boy atmağa başladı və bitkilərdə altıncı yarpaq açıldı.*

13. Deşilmək, dəlinmək, qazılmaq. *Divardan pəncərə açılmışdır. Dağların altından uzun tunel açılmışdır.*

14. Baxmaq, çıxmaq. *Künc otağa yalnız bir qapı açılırdı.* S.Rəhimov. *Cənuba baxan uzun, göy eyvana iki otaq açılırdı.* Mir Cəlal. *Evciyəzlərin qərbə açılan pəncərələrində şüşələr od tutub sarı bir alovla yanırdı.* Ə.Məmmədxanlı.

15. Qopmaq, sökülmək. *Köynəyin bütün tikişləri açılmışdır.*

16. Genişləndirilmək, vüsətləndirilmək, böyüdülmək, genəldilmək, uzadılmaq (sahə). *Otağın arası açılsa, genişlik olar. Paltosunun dalı açıldıqdan sonra genəlmişdir.*

17. Cilalanmaq, pardaqlanmaq, təmizlənmək, sürtülüb ağardılmaq; parıldamaq, işıldamaq. *Mis qablar qumla sürtüldükdə açılar. Şüşə silindikdən sonra açıldı. Dəri pardaqlanıb açıldı.*

18. Ortalığa atılmaq, irəli sürülmək, başlanmaq. *Söhbət açıldı. Bəhs açıldı. İndi ki söz açıldı, söyləməliyəm.*

19. Buluddan azad olmaq, aydınlaşmaq, ayazımaq. *Yağış kəsilən kimi hava açıldı. Göyün üzü açıldı. – Bir-iki dəqiqə davam edən yağışdan sonra göy açılmağa başladı.* Çəmənzəminli. *Hava açıldıqda ata oğlunun əlindən tutub geniş düzənliyə çıxırdı.* S.Rəhimov. *Günəş qırpınanda açıldı hava; Dayandı ordular, durdu üz-üzə.* S.Vurğun.

20. İşıqlaşmaq, işıqlanmaq, işıqlanmağa başlamaq. *Səhər açılmaq. Dan yeri açılmaq. – Ey bəxtimin sitarəsi, bu sübh açılmasın; Mahi-rüxün yetər bu gecə karivanə şəm?* S.Ə.Şirvani. *Payızın sübhü yeni açılmışdı.* S.M.Qənizadə.

21. Atılmaq, partlamaq. *Atılan bombaların heç biri açılmadı. Güllə açılmaq. – Açıldıqda atəş edərdim güman; Ki, göydən yerə od yağır nagəhan.* M.Ə.Sabir. *Güllə açıldıqda köpək yerə sərildi.* S.S.Axundov. *Güllə açılanda Əhməd gördü ki, daha bura qaçmaq yeri deyil; təslim olmağı qət etdi.* B.Talıblı.

22. Boşalmaq, boş qalmaq, boş yer əmələ gəlmək. *Yer açılan kimi səni oraya düzəldərik.*

23. Sağalmamaq, qovuşmamaq, bitişməmək, üstü açılmaq (yara haqqında).

24. Görünməyə başlamaq, zahir olmaq. *Gözlərim önündə gözəl bir mənzərə açıldı. Qarşımızda müharibənin dəhşətli bir səhnəsi açılmışdı. – Yavaş-yavaş dumduru göy qabığının və geniş üfüqlərin əzəmətli mənzərəsi açılırdı.* M.İbrahimov. *Fərruxun nəzərində tamam başqa bir aləm açıldı.* Mir Cəlal.

25. *məc.* Birdən-birə hirslənərək qışqırmaq, bərk danlamaq, acıqlanmaq (bəzən “üstünə, üstümə” sözü ilə). *O, birdən üstümə açıldı.*

26. Başlamaq, çatmaq, yetişmək. *Yaz açılanda havalar qızmağa başlar. – Gül götürdü pərdə yüzündən, açıldı novbahar; Rövnəqi gəldi və nuri-bağü bustanın yenə.* Nəsimi. *Gəlsin bahar fəsli, açılsın yazlar; Göylərə tökülsün ağ quşlar, qazlar.* Qurbani.

27. Baş vermək, üz vermək. *Amma təhlükə özgə tərəfdən açıldı.* M.F.Axundzadə.

28. Axmağa başlamaq. *Borudan su açılmaq. Yaradan qan açılmaq.*

29. Hazırlanmaq, salınmaq, düzəldilmək. *Yemək otağında təntənəli şam süfrəsi açıldığını gördüm.* M.S.Ordubadi. *Sübhanverdizadə birtəhər .. dəhlizə girdi, süfrə açıldı, əvvəlcə toyuq qızartması, sonra rəngli çay verildi*. S.Rəhimov.

30. *dan*. Rədd olmaq, əl çəkmək, getmək. *Nayıbov Lətifin üstünə qışqırdı: – Açıl başımdan!* Mir Cəlal.

31. *məc*. Həll edilmək. *Ömür ipək kələf deyil, açılmayan düyünləri var*. R.Rza.

32. *məc.* Könlü xoş olmaq, məmnun olmaq, üzü gülmək, fərəhlənmək, sevinmək, şad olmaq. *Fərəhdən qönçənin gülgün yanağı güldü, açıldı.* Nəsimi. [Xavər] *uzun iztirablardan .. sonra Kərim xanın qayıtması ilə açılmağa başlamışdı.* M.İbrahimov.

33. Bir sıra sözlərin yanına gətirilərək, müxtəlif ifadələr və mürəkkəb feillər düzəldilir; məs.: könlü açılmaq, dili açılmaq, ürəyi açılmaq, aynası açılmaq, kefi açılmaq.

**AÇILMAZ** *sif.* Açıla bilməyən.

**AÇIM** *is*. Açılma zamanı, açılma müddəti (pambığın və s. bitkilərin).

**AÇIŞ** *is*. Açma işi, açma tərzi.

**AÇMA** "Açmaq"dan *f.is.*

**AÇMAQ** *f.* 1. Qapalı bir şeyin qapağını və s.-ni qaldırmaq, götürmək, çıxartmaq. *Qazanın ağzını açmaq. Qutunu açmaq. Sandığın qapağını açmaq.* // Örtülü bir şeyin örtüyünü qaldırmaq, götürmək, çılpaq etmək. *Döşünü açmaq. Başını açmaq. – Niqabın üzdən aç, ey gül, kim olsun dilguşa məclis.* S.Ə.Şirvani.

2. Açıq hala gətirmək, qapının, pəncərənin taylarını aralamaq. *Qapını açmaq. Pəncərəni açmaq. Pərdəni açmaq. Yol açmaq.* // *məc*. Aradakı maneəni qaldırmaq. *Süngülər açmayan yolu açdın; Qələmindən cavahirat saçdın.* A.Səhhət. *Şəhərin işıqları gecənin qaranlıq pərdəsini yırtır və sanki narın-narın tökülən yağışa yol açırdı.* M.İbrahimov.

3. Qatlanmış, bükülmüş, sarınmış, yığılmış, bürünmüş, düyünlənmiş şeyin qatlarını, büküyünü, qırışığını və s.-ni açmaq. *Bayrağı açmaq. Boğçanı açmaq. Çətiri açmaq. Düyünü açmaq. Gəminin yelkənlərini açmaq. Palazı açmaq.*

4. İp və s. ilə bağlı olan şeyi bağdan azad etmək. *Ayaqqabının qaytanını açmaq. Belini açmaq. Qayışı açmaq. Lenti açmaq. Tayları açmaq.* – [Məstəli şah:] *Xurcunu yerə qoy, ağzının bağını aç, .. taxta parçaları*(*nı*) *çıxart!* M.F.Axundzadə.

5. Qoşqudan azad etmək. *Atları açmaq. Arabanı açmaq. Öküzləri kotandan açmaq.*

6. Qıfıl, kilid və s. ilə bağlanmış şeyi açıq hala gətirmək. *Sandığı açmaq. Qıfılı açmaq.* – [Oruc:] *Bu saatda qayıdarıq, fikir eləmə, sandıqları aç!* M.F.Axundzadə. *Muzdur çamadanı qabağına alıb, açar yerini mismar ilə qurdalamağa başlayıb, axırda açdı.* S.M.Qənizadə.

7. Örtülü, qapalı şeyi aralamaq. *Ağzını açmaq. Gözlərini açmaq. Kitabı açmaq. – Ləbini açsa o gül məhfilə şəkkər tökülür.* S.Ə.Şirvani. *Aç gözün, gözlərinin qurbanı; Bir tamaşa elə, gör dünyanı.* A.Səhhət.

8. Axışı dayandırılmış şeyin axıb getməsinə imkan vermək, yol vermək, buraxmaq. *Qazı açmaq. Suyu açmaq.*

9. Başlamaq, işə salmaq. *İclası açmaq. Mübahisə açmaq. – Yenə bir neçə yerdən pulemyot atəşi açıb təkrar hücuma qalxışdılar.* M.Hüseyn. *Bir enlikürək, boy-buxunlu oğlan iclası açdı, danışdı.* Mir Cəlal. *O vaxt olub-keçəni gətirib bir-bir yada; Mən söhbət açacağam əsgərlikdən, davadan.* Ə.Cəmil.

10. Əsasını qoymaq, təsis etmək, təşkil etmək. *Məktəb açmaq. Klub açmaq. Yeni dəmiryol xətti açmaq.* // Düzəltmək. *Hər biri min gunə iş icad edir; Məclis açıb, nitqlər irad edir.* M.Ə.Sabir.

11. Yaratmaq, vermək, vücuda gətirmək. *Fəaliyyət üçün geniş meydan açmaq. Yeni tapılan neft yataqları bu yerlərin inkişafı üçün geniş imkanlar açır.*

12. İnanıb söyləmək, bildirmək, xəbər vermək, açıqcasına demək. *Həqiqəti açmaq. Öz qəlbini açmaq.* – *..Lakin Mirzə Süleyman bəy ürəyini açmayırdı.* B.Talıblı. *Ancaq* [Habil] *Bəxti ilə yol yoldaşı olmaq, düyələrin əhvalatını da açmaq, .. onun azarını üzünə demək istəyirdi.* S.Rəhimov. *Yox... sənin səsində bir titrəyiş var; Gəl məndən gizlətmə, aç, söylə aşkar.* S.Vurğun. // Gizli bir şeyi başqalarına bildirmək, faş etmək, demək, açıb söyləmək. *Sirri açmaq.* – [Teymur ağa:] *Vallah, hər kəs mənim bura gəlməyimi açmış olsa, bu xəncəri dəstəsinədək ürəyindən çaxacağam.* M.F.Axundzadə. *Sirri-dəhəni-yarı könül, axtar özün tap; Söz yox ki, açıb şəxsə müəmmanı deməzlər.* S.Ə.Şirvani. [Südabənin] *danışıq və rəftarında bir səmimiyyət duyan Firidun kasıb bir tələbə olduğunu açıb ona söylədi.* M.İbrahimov.

13. Üstünü açmaq, ifşa etmək, aşkara çıxarmaq, meydana çıxarmaq, araşdırıb tapmaq. *Cinayəti açmaq.* – [Ağa Mərdan:] *Hacı Rəcəbəli əldə olmasa bu işi aşırmaq olmaz. Yoxsa işin üstünü açar...* M.F.Axundzadə.

14. Çiçəklənmək, güllənmək, yarpaqlanmaq. *Ağaclar gül açmışdı. Çöllərdə lalələr açmışdır.* – [Südabənin anası:] *Yəqin indi oralarda badam güllənir, hə?.. Bir azdan sonra ərik də, alma da gül açar.* M.İbrahimov.

15. *məc. dan.* Xoşuna getmək, ürəyinə yatmaq, işinə yaramaq, sevindirmək. *Nə də ki, o durna gözlərin sənin; Artıq güldürməyir, açmayır məni.* S.Vurğun. *Xüsusən təyyarə meydançası haqqındakı məlumat məni açdı.* M.Hüseyn.

16. Deşmək, dəlmək, qazımaq (bir yeri, bir şeyi və s.). *Dəlik açmaq. Qapı açmaq. Yerin altından yol açmaq. Tunel açmaq. Lağım açmaq. Divardan pəncərə açmaq.*

17. Genişlətmək, vüsətləndirmək; uzatmaq, böyütmək, genəltmək. *Otağın arasını açmaq. Paltarın ətəyini açmaq. Paltonun dalını bir qədər açmaq lazımdır.*

18. Cilalandırmaq, pardaqlamaq, sürtüb ağartmaq, parıldatmaq, işıldatmaq, təmizləmək. *Bıçaqları qumla sürtüb açmaq. Pəncərələrin şüşəsini silib açmaq.*

19. Həll etmək, yoluna salmaq, tədbir görmək. *Vidadi! Darıxma, bizdə məsəl var; Bir yandan bağlayan, bir yandan açar.* S.Vurğun. [Molla Qafar:] *Bilirsən, həmşirə, – dedi, – bu bədəməl şəriətə sığmır, heç bilmirəm ki, bu müşkülatı nə gunə açım?* S.Rəhimov.

20. Bir sıra isimlərə qoşularaq mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: ürək açmaq, könül açmaq, ağız açmaq, göz açmaq, fal açmaq.

◊ **Açıb ağartmaq** – b a x **ağartmaq** 5-ci mənada. *Ülfət oğlunun bir qız ilə gəzdiyini bilirdisə də, açıb ağartmırdı.* Mir Cəlal.

**AÇUN** *is. qəd.* Dünya, aləm, kainat. *Yenə ölgün sükuta batdı açun; Qantəmir indi büsbütün məcnun.* C.Cabbarlı.

**AD** *is.* 1. Doğulduğu zaman adama verilən şəxsi isim. *Ad və soyad. Ad qoymaq. Adın nədir? Adını söyləmək.* – *Sən öləsən, Xanmirzə bəyin adını verən kimi, qoçaqlar o saat qalxdılar.* N.Vəzirov. // Ləqəb, təxəllüs.

2. Şöhrət. [Elmar:] *Siz qızları ad maraqlandırır.* İ.Əfəndiyev. // Bir adam haqqında əmələ gəlmiş ümumi rəy. *Yaxşı ad. Pis ad.* – *Yaxşı igid yaman etməz adını; Yaman ad etməkdən ölüm yaxşıdı.* Xəstə Qasım.

3. Bir şeyin şifahi işarəsi. *Kitabın adı. Bitkinin adı.* – *Lətifə oxuduğu kitabların adını çəkir, bəzilərinin qısa məzmununu danışırdı.* M.Hüseyn. *Ülfət "toy" adı eşidib əvvəl tutuldu.* Mir Cəlal.

4. Hər hansı bir iş sahəsində ixtisası və ya xidməti vəziyyəti müəyyən edən rəsmi rütbə, ünvan. *Fəxri ad. Baş elmi işçi adı almaq. Nobel mükafatı laureatı fəxri adı. Şahmat üzrə dünya çempionu adı.*

5. *məc.* Əsas, bəhanə, səbəb mənasında. *..İndi sənin mənə badalaq qurmağının heç adı yoxdur.* Ə.Haqverdiyev.

◊ **Ad almaq** – b a x **ad qazanmaq (çıxarmaq).** *Sən də igidlər kimi iş gör, ad al!* M.Ə.Sabir. **Ad batırmaq** – nüfuzdan düşmək, etibardan düşmək, hörmətdən düşmək (salmaq). **Ad eləmək (etmək)** – 1) b a x **ad qazanmaq (çıxarmaq)**. *Seyyidibəxti qəranı gər məlalımdır desən; Ey adın qurbanı, mən aləmdə bir ad eylərəm.*

S.Ə.Şirvani; 2) adaxlamaq, nişanlamaq. *Vay o gündən ki, məni ad elədiz; Elə bildiz də ki, dilşad elədiz.* M.Ə.Sabir. *Qardaşlar bu iki uşağı bir-birinə körpə vaxtlarından ad etmişdilər.* S.S.Axundov. **Ad qazanmaq (çıxarmaq)** – şöhrət qazanmaq, məşhur olmaq. *Yaxşılıqda ad qazanmaq. Pislikdə ad çıxarmaq. O, fizika sahəsində böyük ad qazanmışdır. – Otuz il qoymuşdu can balıqçı gəmisində; Ad qazanmışdı Qurban balıqçı gəmisində*. S.Rüstəm. **Ad qazanmış** – şöhrət tapmış, tanınmış, məşhur. *Zərgər Hacı Məhəmməd öz sənətində ad qazanmış bir adam idi.* H.Sarabski. **Ad qoymaq** – 1) yaxşı işləri ilə adını əbədiləşdirmək, şöhrət qazanmaq (bu mənada "ad qoyub getmək" şəklində də işlənir). *Yetişdi sahilə köhnə tərlanım; Tarixdə ad qoyan o qəhrəmanım.* S.Vurğun; 2) böhtan atmaq, ləkələmək, biabır etmək, bədnam etmək. **Ad olmaq** – nişanlanmaq, adaxlanmaq. *Nazlı dilbər özgələrə ad olsa; İşim-gücüm nalə olsa, dad olsa; Dəli könlüm dost kuyindən yad olsa; Kəsilərmi bu qafqafa, görəsən?* Q.Zakir. [Şahbaz bəy:] *Özün bilirsən ki,* [Nəcibə] *sənə ad olubdur*. S.S.Axundov. **Ad tutmaq (çəkmək)** – söhbət zamanı yeri gəlmişkən birinin adını çəkmək, haqqında danışmaq. // Yada salmaq, xatırlamaq. *Şəhərdə nə çoxdu yurdsuz-yuvasız uşaq, üzünə baxan kimdi? Adını tutan, yaxına qoyan kimdi?* Mir Cəlal. **Ad vermək** – 1) çuğullamaq, şeytanlamaq, xəbərçilik etmək; 2) qiymətləndirmək. *Buna nə ad vermək olar?* **Adı anılmaq (söylənmək)** – xatırlanmaq. **Adı batmaq** – şöhrətdən, nüfuzdan düşmək, rüsvay olmaq, biabır olmaq. *Atalar oğul istər ki, adı batmasın.* **Adı çəkilmək** – 1) b a x **adı anılmaq.** *Yuxu, həsrətlə adı çəkilən şeylərdən biridir.* Mir Cəlal; 2) namizədliyi qoyulmaq. **Adı çıxmaq** – şöhrət qazanmaq, məşhur olmaq (bəzən mənfi mənada işlənir). [Laçının] *kənd uşaqları arasında adı çıxmışdı*. M.Hüseyn. **Adı dillərdə dastan olmaq (söylənmək)** – məşhur olmaq, şöhrət qazanmaq. *Fənalıq, eyilik bil nə deməkdir; Yarın adın dastan olur dillərdə.* H.Cavid. [Erkək Tükəzban] *ümumi mahalda özünə bir şöhrət qazanıb, adı dillərdə söylənməkdə idi*. B.Talıblı. **Adı qalmaq** – özündən sonra yaxşı bir iş, əsər qoyub getməklə adı əbədiləşmək. **Adı qara gəlmək** – ölmək, yası tutulmaq. **Adı pis çıxmaq** – pis ad çıxarmaq, pislikdə adı söylənmək. **Adı var, özü yox** – yalnız sözdə olub həqiqətdə mövcud olmayan şey haqqında. **Adı yanmaq** – b a x **adı batmaq**. **Adın batsın!** – nifrin, qarğış məqamında işlənən ifadə. *Zülmkar ismi ilə aləmə oldun məşhur; Yeri, ey çərx, adın batsın, əcəb ad etdin.* S.Ə.Şirvani. **Adına dəyməz** – adına, mövqeyinə yaraşmaz. **Yaman ad** – 1) pis ad, şərəfsizlik, bədnamlıq; 2) bəzən böyük ad, şöhrət mənasında işlənir.

**ADA** *is. coğr.* Hər tərəfi su ilə əhatə olunmuş quru; cəzirə. *Pirallahı adası. Kuril adaları. Yarımadalar və adalar Avropanın bütün sahəsinin üçdə bir hissəsini tutur.* // Təşbih, bənzətmə mənasında. *Ürəyim dəryadır, könlüm bir ada; Dərdim oldu günügündən ziyada*. Aşıq Kərəm. *Təpələrin döşlərində qurulmuş alaçıqlar bu yaşıllıq dənizi içərisində bir adanı xatırladır..* Ə.Sadiq.

**ADAB** *is.* [*ər.* "ədəb" söz. cəmi] *köhn.* Əxlaq qaydaları, ədəb qaydaları, cəmiyyətdə ünsiyyət qaydaları. *Bilmək adabdır sənə vacib; Rəsmü adabə olgilən talib.* S.Ə.Şirvani. [Mister Tomas] *..müsəlman ölkələrinin həyat və məişətini, adab və ənənələrini .. uzun mütaliə və müşahidələr nəticəsində öyrənə bilmişdi*. M.İbrahimov. // Dəb, üsul, qayda. [Mirzə:] *Burada lazım olan adabı yazmışam*. Ə.Haqverdiyev. *Aralığa İran adabı üzrə çay deyil, balaca zərli qrafinlərdə konyak və şirniyyat gətirdilər.* M.İbrahimov.

**ADACIQ** *kiç*. Kiçik ada, kiçik cəzirə.

**ADADOVŞANI** *is. zool.* Əhli şəraitdə saxlanıb artırılan dovşan növü. *Adadovşanı çox tez törəyib artan heyvandır.*

**ADAX** *is*. Ad, nişan, deyik. *Adax günü.*

**ADAXLAMA** "Adaxlamaq"dan *f.is.*

**ADAXLAMAQ** *f.* Nişanlamaq, ad etmək. *Haman ili məni səkkiz yaşlı bir qızla adaxladılar.* M.İbrahimov.

**ADAXLANDIRMA** b a x **adaxlanma.**

**ADAXLANDIRMAQ** b a x **adaxlanmaq.**

**ADAXLANMA** "Adaxlanmaq"dan *f.is.*

**ADAXLANMAQ** *f.* Nişanlanmaq, nişan taxılmaq. *Sevmək, adaxlanmaq, toy günləri, gəlin köçləri şirin bir xəyal kimi Məşuqənin gözləri qabağında açılıb vərəqlənir.* S.Rəhimov. *Bir tərəfdən oynaq qəlbi əsgərlik eşqində idi, o biri tərəfdən də iki ildir adaxlandığı Durna onun* [Xasayın] *yadından çıxmır..* Ə.Vəliyev.

**ADAXLI** *is.* və *sif.* Nişanlı, deyikli; nişanlanmış, adaxlanmış. [Şəhrəbanı xanım:] *Allaha şükür, atan sağ, anan sağ. Gözəl-göyçək adaxlın gözünün qabağında*. M.F.Axundzadə. *Adaxlı gözlərini tərif edəndə, Səlimnaz arvadın təbi coşdu..* M.Hüseyn.

**ADAXLIBAZLIQ** *is. dan.* 1. Köhnə məişətdə: oğlanın gizli olaraq adaxlısı ilə görüşməsi. *Padşahın oğlu bir-iki dəfə adaxlıbazlığa gəldisə, qız elə dediyini dedi: – Əlimə su tökməsən, on il də yaşasan, səmt-sorağıma qoymaram.* (Nağıl). [Məşədi İbad:] *Mən istədim ki, adaxlıbazlığa gecə gəlim, halbuki gündüz də bu hasardan aşmaq çətindir.* Ü.Hacıbəyov. *Azərbaycanda evlənmək adətlərində belə bir dəb var idi ki, adaxlı oğlan axşamlar qızı görmək üçün adaxlıbazlığa gedərdi.* H.Sarabski.

2. Qadınlarla xəlvəti görüşmə; müaşiqə.

**ADAXLILIQ** *is.* Adaxlı olma.

**ADÁJİO** *is.* [*ital.*] *mus.* 1. Ağır tempdə çalmaq lazım gəldiyini göstərən musiqi termini.

2. Ağır tempdə ifa edilən, adətən lirik xarakterli musiqi pyesi, yaxud bir musiqi əsərinin bu tempdə ifa edilən hissəsi.

**ADAQ**[1] *is. məh.* Uşağın ilk addımı, ilk yerişi. ☐ **Adaq durmaq** – ayaq üstə durmaq (uşaq haqqında). **Adaq yerimək** – təzəcə yeriməyə başlamaq.

**adaq-adaq** *zərf dan.* Yavaş-yavaş, addım-addım.

**ADAQ**[2] b a x **adax.** ☐ **Adaq eləmək** – b a x **adaxlamaq**.

**ADAQLAMAQ** b a x **adaxlanma**.

**ADAQLANMAQ** b a x **adaxlanmaq.**

**ADAQLI** b a x **adaxlı.** *Ol sərvin ayağı bağlı oldu; Azadə ikən, adaqlı oldu.* Füzuli.

**ADAM** *is.* [*ər.*] 1. Heyvandan fərqli olaraq danışmaq və düşünmək, ictimai əmək prosesində alət qayırmaq və ondan istifadə etmək qabiliyyətinə malik olan canlı məxluq; insan, bəşər. *Sağlam adam. Bilikli adam. – Suyun lal axanı, adamın yerə baxanı.* (Ata. sözü). *Nə gözəl adamsan, ey qaşları yay; Heç növcavan gələ bilməz sənə tay.* M.P.Vaqif. // Hər hansı bir ictimai mühiti təşkil edən fərdlərdən hər biri (çox vaxt cəm şəklində işlənir). *Adamların mənəvi-siyasi birliyi. Bizim kəndin adamları. Sadə adamlar.*

2. *məc. dan.* Əxlaqlı, insaniyyətli, qanacaqlı insan. [İskəndər:] *Amma bu dılğırların heç birindən eşitmədim ki, desin: – Bala, adam ol.* C.Məmmədquluzadə.

3. Bəzən əvəzlik yerində işlənir. *Adamı təhqir etmək olmaz. Adam heç bir vaxt özünü ləkələndirməməlidir. Adam gəlmişdi, sizi xəbər alırdı. Adama heç yazığın gəlmir.* – [Usta Ramazan:] *Adamın üzündə gərək həya olsun, söz deyiləndə utansın.* M.Hüseyn. [Nəriman:] *Ağacların başını axtardıq, zirzəmilərə adam saldıq*. Mir Cəlal. // Qeyri-müəyyən şəxs. *Adamlar deyirlər ki, bu yay çox isti olacaq. – Vağzalın platformasında bir neçə nəfər adam görünürdü*. S.M.Qənizadə.

4. *dan.* Kişi, ər, ya arvad, yaxud bir-biri ilə gəzən oğlan, ya qız. [Soltan bəy:] *Kimsən, nəçisən, kimin adamısan?* Ü.Hacıbəyov.

5. *məc.* İşçi, fəhlə, kadr mənasında. *İşi başa çatdırmaq üçün üç adam lazımdır. Adam yoxdur, iş getmir. – Katib sanki tikintidə bu cür yaxşı adamların yetişməsindən qəlbində doğan sevinci saxlaya bilməyərək əlavə etdi..* Ə.Sadıq.

6. Köməkçi. *Bu halda qışqırıq qopur. Murov və naçalnik adamları ilə alaçığı çevirirlər.* M.F.Axundzadə. *..Sərdar Rəşidin adamları Ərdəbil tərəflərini soyub talayırdılar.* M.S.Ordubadi. // *məc. dan.* Arxa, havadar, tərəfdar, kömək, himayəçi, qohum-qardaş. *Mənim orada adamım yoxdur*. – [Qulluqçular] *İzzətin adamı gəlmədiyini görüb onu ötürərdilər.* Mir Cəlal.

7. *məc. vulq.* Oynaş, aşna.

◊ **Adam eləmək** – tərbiyə vermək, yetişdirmək, ortalığa çıxarmaq. **Adam görmək** – bir işi düzəltmək üçün vasitəçi tapmaq, lazımi şəxsləri görüb xahiş etmək, sözləşmək. **Adam kimi** – əxlaq və tərbiyə üzrə, adamcasına, insancasına. [Həsən:] *Mən Həzrətquluya adam kimi söz deyirəm, deyir,*

*cığcığa əsginas vermişəm.* Ə.Haqverdiyev. **Adam olmaq** – 1) ağıllı və tərbiyəli olmaq, düzəlmək, ağıllanmaq. *Dadaşovun üzündən nur yağırdı, elə bil bircə anın içində dəyişib tamam başqa adam olmuşdu.* İ.Məlikzadə; 2) bir peşə, iş sahibi olmaq, ortaya çıxmaq. [Əli bəy:] *A kişi, heç kəsin sözünə qulaq asma. İstəyirsənsə oğlun adam olsun, şkolaya qoy.* S.S.Axundov. [Həbib bəy Ərəblinskiyə:] *Yaxşı oxu, adam ol, bizim də üzümüz ağ olsun, ananın da.* S.Rəhman. **Adam saymaq** – birisi ilə hesablaşmaq, hörmət etmək. **Adam yerinə qoymamaq, adam yerində tutmamaq** – saymamaq, hesablaşmamaq, hörmət etməmək. **Aralıq adamı** – 1) vasitəçi, aradüzəldən; 2) xəbərçi, xəbər aparıb-gətirən.

**ADAM-ADAMYANA** b a x **adamyana.**

**ADAMAĞILLI** *sif.* Lazımi şəkildə, əməllibaşlı, yararlı.

**ADAMALDADAN** *sif.* və *is.* Yalançı, adamları aldatmaqla məşğul olan.

**ADAMAOXŞAMAZ** *sif.* Çirkin, biçimsiz, eybəcər, bədləkər. // Söyüş, təhqir mənasında. *Ay adamaoxşamaz, bir üzünə baxsana; Bomboz olub saqqalın, rəngü həna yaxsana.* M.Ə.Sabir.

**ADAMAOXŞAMAZLIQ** *is.* Çirkinlik, eybəcərlik, biçimsizlik, bədləkərlik.

**ADAMAYOVUŞAN** *sif.* Adamlarla ünsiyyət bağlayan, xoşxasiyyət, istiqanlı, mehriban.

**ADAMAYOVUŞMAZ** *sif.* Adamdan qaçan, cəmiyyətdən qaçan, ürkək; qaraqabaq, qanısoyuq, mızı.

**ADAMAYOVUŞMAZLIQ** *is.* Adamdan qaçmaq, cəmiyyətdən qaçmaq xasiyyəti; qaraqabaqlıq, qanısoyuqluq, mızılıq.

**ADAMBAŞI(NA)** *zərf* Hər bir adama, hər bir nəfərə, yaxud hər bir nəfərdən. *Adambaşı 5 manat yığdıq. Adambaşı(na) neçə düşür?*

**ADAMBOYU** *sif.* Adam hündürlüyündə olan. *Adamboyu qar yağmışdı. Küçələrdə adamboyu ağaclar əkilmişdir.*

**ADAMCASINA** *zərf* İnsana yaraşan bir surətdə, insancasına, insan kimi, humanistcəsinə. *Adamcasına hərəkət etmək. Adamcasına rəftar etmək.*

**ADAMCIĞAZ** *oxş.* Yazıq adam, fağır adam; zavallı, mərhəmətə layiq insan (bəzən kinayə və istehza ilə "məhdud düşüncəli, səthi adam" mənasında işlənir). *Adamcığaz az qala maşının altında qalmışdı.*

**ADAMCIL** *sif.* Adamyeyən, insan qanına həris olan. // Vəhşi, yırtıcı.

**ADAMCILLIQ** *is.* Vəhşilik, yırtıcılıq.

**ADAMDANQAÇAN** *sif.* Adamlara uyuşmayan, adamlarla ünsiyyət bağlamayan, ürkək.

**ADAMLI** *sif. dan.* Yaxın adamı, böyüyü olan; köməyi, arxası, himayəçisi, qohum-əqrəbası olan.

**ADAMLIQ** *is.* 1. İnsanlıq, tərbiyəlilik; ünsiyyət, adamlarla yola getmə. *Onun heç bir adamlığı yoxdur.* – [Nəcəf:] *Bu da bizim adamlığımız!..* İ.Əfəndiyev.

2. Doğruluq, alicənablıq, insanpərvərlik, xeyirxahlıq, yaxşılıq.

**...adamlıq** Adətən saylara qoşularaq, şeyin neçə nəfərə, şəxsə aid olduğunu göstərir; məs.: *biradamlıq nömrə, ikiadamlıq loja, beşadamlıq yer.* – [Səadət xanım:] [Səriyyə], *hər gün biradamlıq nahar hazırlayacaqsan..* M.İbrahimov.

**ADAMOYNADAN** *is.* və *sif. dan.* Adamı araya qoyan, adam ələ salan, adama lağ edən, lağa qoyan.

**ADAMSATAN** *is.* Xain; xəbərçi.

**ADAMSEVMƏZ** *sif.* və *is.* Adamları sevməyən, adamlardan xoşu gəlməyən, adamlardan qaçan, mərdümgiriz.

**ADAMSEVMƏZLİK** *is.* Adamsevməz adamın xasiyyəti.

**ADAMSIZ** *sif.* Kimsəsiz, yalnız; adamı, köməkçisi olmayan; arxasız, himayəsiz. *O adamsızdır, heç kəsi yoxdur.*

**ADAMSIZLIQ** *is.* Kimsəsizlik, yalnızlıq, köməksizlik, arxasızlıq, himayəsizlik.

**ADAMSİT** [*xüs. is.*-dən] *kim.* Burun və boğazın selikli qişasına təsir edən zəhərləyici maddə.

**ADAMYANA** *dan.* 1. *zərf* b a x **adamcasına.** *Pəs, biz deyirik ki, yumruq, sillə ortalıqdan çıxsın, uşaq ilə adamyana rəftar olsun ki, özü yaxşını yamandan dərk edib, bəd əmələ mürtəkib olmasın.* "Əkinçi".

2. *sif.* Gözəl, yaxşı, abırlı, layiqli, əməllibaşlı.

**ADAMYEYƏN** *sif.* İnsan əti yeyən, vəhşi, yamyam. *Əbəs-əbəs neçin qaçırsan məndən; Mən ki, zalım, adamyeyən deyiləm.* M.P.Vaqif. *Adam da, div də, adamyeyən vəhşi heyvan da; Sənətin yüksəlişiylə mədəniyyətin zirvəsində; Əxlaqın süqutu ilə vəhşiliyin dibindədir.* Şəhriyar.

**ADAPTÁSİYA** [*lat.* adapto – uyğunlaşdırıram] Orqanizmin quruluş və funksiyasının şəraitə uyğunlaşması.

**ADÁPTER** [əsli *lat.*] Qrammofon (patefon) valının səsini reproduktor vasitəsilə vermək üçün elektromaqnitli cihaz.

**ADAŞ** *is*. Adları eyni olan adamlar. *O mənimlə adaşdır. Adaşlar gəldilər. – Dodaqlarında kövrək təbəssüm, gözlərində maraq. – Tez sağal! – dedi, – adaş!* R.Rza.

**ADAŞLIQ** *is*. İki və ya bir neçə adamın eyni adda olması.

**ADAT** *is*. [*ər.* "adət" söz. cəmi] b a x **adət**. *Məstəli Şirvani hər iki səyahətində dünyanın yarısını gəştü güzar edib, altmışdan ziyadə müxtəlif ayin və adat üzrə yaşayan .. miləl və əqvam ilə tanış olubdur.* F.Köçərli.

**ADBAAD** *zərf* Hər kəsi, yaxud hər şeyi öz adı ilə, bir-bir adlarını deyərək. *Adbaad çağırmaq. Adbaad yazmaq. – Mən sizi adbaad murova nişan verib istəmişəm..* M.F.Axundzadə. *Mirkərim ağa bu işlərin cəmisini adbaad yazıb..* C.Məmmədquluzadə. [Musa] *damdan-divardan boylanan çantalı uşaqları bəzən adbaad çağırıb içəri salardı.* Mir Cəlal.

**ADDA-BUDDA** 1. *zərf* Oradan-buradan, rabitəsiz. *Adda-budda danışmaq. – Əziz xan əlini saldı cibinə, bir qayıtdı qonaqlara səmt, bir çöndü Məmmədhüseynə tərəf və başladı adda-budda danışmağa.* C.Məmmədquluzadə. // Dağınıq, nizamsız, qarışıq, pərakəndə, tərtibsiz. *Qara damlar adda-budda salınmışdı, dal tərəflərində təzək qalaqlanmışdı.* Çəmənzəminli. *..Toz basmış tikan, yolğun kolları, adda-budda göyərən çöl qarpızları .. hamısı deyəsən dünənkilərdir*. Mir Cəlal.

2. *sif.* Başqalarının torpaqlarının içərisinə girmiş; dağınıq. *Adda-budda əkin.*

**ADDA-BUDDALIQ** *is*. 1. Nizamsızlıq, tərtibsizlik, rabitəsizlik, dağınıqlıq, qarışıqlıq.

2. Bir təsərrüfata məxsus torpaq sahələrinin özgə təsərrüfatın torpaqları içərisində dağınıq halda olması. *Adda-buddalıq yalnız kənd təsərrüfatı ictimailəşdikdən sonra tamamilə ortadan çıxdı.*

**ADDAMA** 1. "Addamaq"dan *f.is.*

2. *is. məh.* Çaydan, arxdan keçmək üçün düzəldilmiş keçid.

**ADDAMAQ** *f.* Üstündən keçmək, üzərindən atılıb keçmək, aşıb keçmək, aşmaq. *Çəpəri addamaq. Arxın o tayına addamaq.* – [Şahvələd] *o vaxt gəlib çatdı ki, gördü Qərib Kürü addayıb, kor-peşman geri qayıtdı Tiflisə.* "Aşıq Qərib". [Gəldiyev] *fındıqlı deyilən balaca dərəni addayıb, meşəyə çıxmaq istədi.* Mir Cəlal. // Bir yerdən o biri yerə keçmək. *..Kərim bəy Nərimanı özü oxutmuş, hər sinif addadıqca, bir mükafat ilə həvəsləndirmiş*(*di*).. Mir Cəlal. // *məc*. Ötmək, keçmək, aşmaq. – *Şeyx Şəbanın yaşı altmışdan addamışdı*. Ə.Haqverdiyev.

**ADDIM** *is.* 1. Yeriyərkən ayağın qaldırılıb irəli atılmasından ibarət hərəkət; qədəm. *Ağır addım. İri addım. Addım səsi eşitmək. Addımını yavaşıtmaq. Addımını sürətləndirmək.*

2. Bir addım arasındakı məsafə qədər uzunluq ölçüsü. *Həyətin uzunu 20 addımdır. Məktəblə evin arası 200 addım olar. – Üç addım o tərəfdə kiçik bir qız fəryad edir.* Ə.Məmmədxanlı. ◻ **Bir neçə addımda** – çox yaxında, lap yaxında. [Əmir İnanc:] *Sizin fəaliyyətsizliyiniz nəticəsində Gəncənin bir neçə addımlığında xəlifənin qasidini tutub soyundururlar.* M.S.Ordubadi.

3. *məc*. Hərəkət, iş, təşəbbüs. *Təhlükəli addım atmaq. Fikirləşmədən addım atmaq.*

4. "Sürətli", "qəti" və s. sözlərlə bərabər bir şeyin irəliləməsini, inkişafını göstərmək üçün işlənir.

◊ **Addım açmaq (götürmək)** – yeyin getməyə başlamaq, getdikcə addımını artırmaq, yerişini sürətləndirmək. **Addım atmaq** – 1) b a x **addımlamaq** 1 və 3-cü mənalarda; 2) *məc*. təşəbbüs etmək. **Addımına haram qatmaq** – yerişini bir qədər sürətləndirmək. **Div addımları ilə irəliləmək** – b a x **div. Hər addımda, hər addım başında** – b a x **addımbaşı. İlk addım atmaq** – bir işdə təşəbbüsçü olmaq, birinci çıxış etmək. **İlk addım(lar)** – hər hansı işin, fəaliyyətin

ilk dövrü. *Elə ilk addımda atın gözü qorxsaydı, bircə dəfə diränib dursaydı, sonra fələk özü gələydi yenə ürgəni irəli qova bilməzdi..* Ə.Məmmədxanlı.

**addım-addım** *zərf* Ağır-ağır, yavaş-yavaş. *Addım-addım yerimək. Addım-addım irəliləmək. – Gələn adam idi. Sinəsinə, addım-addım ehtiyatla yeriyirdi.* Mir Cəlal. *Mən bu gözəl diyarı dolaşıb addım-addım; Min budaqdan-budağa özümü quş-tək atdım.* Ə.Cəmil.

**ADDIMBAADDIM** *zərf* Addımlarla, addım atdıqca, addım-addım izləyərək (başqasını).

**ADDIMBAŞI** *zərf* Hər addımda, hər yerdə, tez-tez, arası kəsilmədən. *Nəğməyə söz verək, ötək ucadan; Şirin bülbül kimi hər addımbaşı.* M.Rahim. *..Usta ona* [Davuda] *müstəqil iş tapşırır, addımbaşı yoxlayırdı.* Mir Cəlal. *Divanxana qapısında belə şeylərə addımbaşı rast gəlmək olardı.* P.Makulu.

**ADDIMLAMA** "Addımlamaq"dan *f.is.*

**ADDIMLAMAQ** *f.* 1. Müntəzəm addımlarla yerimək, irəliləmək, irəli addım atmaq. [Firidun] *tez özünü düzəldib irəli addımladı.* M.İbrahimov. *Gülnaz irəlidəki dəstədən xeyli geri qaldıqlarını elə bil yalnız indicə anlayıb sürətlə addımladı.* M.Hüseyn.

2. Addımla ölçmək, addım saymaq.

3. *məc.* Ötmək, keçmək, ötüb-keçmək. *Günlər addımlayır, gedir irəli..* S.Vurğun.

**ADDIMLATMAQ** "Addımlamaq"dan *icb.*

**ADDIMLI** *sif.* Yeriyərkən iri addım atan, addımı iri olan.

**ADDIMLIQ** *is.* 1. Bir addım məsafə.

2. Adətən saylara qoşularaq məsafənin neçə addım olduğunu göstərir. *Həyət qapısından girən kimi sola burulmaq və beş addımlıqdakı dar pilləkənlərdən enmək lazım gəldi.* M.İbrahimov.

**ADDIMÖLÇƏN** *is. xüs.* Piyada gedilən məsafəni ölçmək üçün cihaz.

**ÁDDİSON** [*xüs. is.*-dən] Böyrəküstü vəzilərin qabıq qatı funksiyasının xronik çatışmazlığı xəstəliyi. *Addison xəstəliyinin əlamətləri.*

**ADEKVÁT** *sif.* [*lat.*] Eyni, uyğun, mütabiq. *Adekvat cisim və hadisələr.*

**ADENÓMA** *is.* [*yun.*] *tib.* Bədənin müxtəlif üzvlərində əmələ gələn xoşxassəli şiş. *Adenoma vaxtında cərrahi yolla müalicə edilməlidir.*

**ADƏ** *nida, dan.* Haylama, çağırma, çağırış nidası (adətən oğlanlara deyilir). [Hacı Həsən:] *Adə, Heydər! Durma, tez evə xəbər elə ki, otaqlara fərş salsınlar, qonaq gələcək.* C.Məmmədquluzadə. *Bəsdir, bu qədər başlama fəryadə, əkinçi; Qoyma özünü tülkülüyə, adə, əkinçi!* M.Ə.Sabir. *Rəhim bəy acıqlı-acıqlı soruşdu: – Adə, olmaz ki, çörəyimizi yeyəndən sonra gəlsin?* M.Hüseyn.

**ADƏM** [*ər.*] b a x **adam**. *Səcdə qıl yarə könül, baxma o zahid sözünə; Adəm ol, mətləbi qan, eyləmə şeytan ilə bəhs.* S.Ə.Şirvani.

◊ **Adəm alması** *anat.* – qığırdağın çıxıq yeri; xirtdək. *..Adəm alması deyilən xirtdək sümüyündən heç bir əsər-əlamət görünməzdi.* Ə.Əbülhəsən. **Adəm oğlu** – bəşər, insan, adam. *Sənə kimdir adəm oğlu deyən? Allah! Allah! Allah! Bu sifətdə kim görübdür bəşəri cahan içində.* Nəsimi. **Adəm övladı** – insanlar, bəşəriyyət, insanlıq. *..O vaxtdan şeytan adəm övladının qəlbində qalıb, onu hər bir pislik tərəfinə çəkir.* Ə.Haqverdiyev. **Adəmdən xatəmə** – dünyanın əmələ gəlməsindən bu günə kimi, heç bir vaxt. [Molla:] *Adəmdən xatəmə görünməyib ki, bir nəfər rəiyyət oğlu bir xanzadənin üzünə ağ olsun.* P.Makulu.

**ADƏT** *is.* [*ər.*] 1. Hər hansı bir xalqın həyatında qədimdən bəri qəbul edilmiş və kök salmış ənənə, rəsm. *Rayonlarda xurafat və köhnə adət təsirlərindən qurtulmayan işçiləri biabır edirdilər..* Mir Cəlal. // Qayda, dəb. *Başına döndüyüm, ay qəşəng pəri. Adətdir dərərlər yaz bənövşəni.* Qurbani. *Adətdi ki, pərvanə edər narə məhəbbət.* S.Ə.Şirvani. *Axır, adət bu cürdür ki, kattanı camaat seçər.* C.Məmmədquluzadə.

2. Bir adam üçün adi hal almış qayda, üsul, hərəkət tərzi, təmayül; vərdiş. *Bahadır şam yandırıb, öz adətinə görə başladı qəzet oxumağa.* N.Nərimanov. *Səba xanım adəti üzrə, vəzifəsində çətinlik hiss edən adamlar kimi, boynunu çiyninə qoyaraq: – Əlacım nədir? – dedi.* M.S.Ordubadi. // Xasiyyət mənasında. *Səgrəqib sözünə etibar etmək; Bilməzəm, xublarda bu nə adətdi.* Q.Zakir. *Hərçənd xublarda bu adətdi naz*

*olur; Sən tək və leyk naz qılan yar az olur.* S.Ə.Şirvani. □ **Adət etmək** – bir şeyi çox təkrar edərək ona alışmaq, vərdiş etmək, öyrəşmək. *Gecikməyi adət etmisən ha! Səhər tezdən durmağı adət etmək. – Bəsti sürətlə və düzgün işləməyi adət etmişdi.* Ə.Sadıq.

**ADƏTA** b a x **adətən.** *Bu nə müdhiş hava, susuzluqdan; Adəta qıvrılıb yanar insan.* H.Cavid.

**ADƏTƏN** *zərf* [*ər.*] Adət üzrə, həmişə olduğu kimi, bir qayda olaraq, daim, həmişə. *Adətən az danışmağı sevən usta Ramazan şagirdinin üzünə baxmadan, bütün ürəyini boşaltmağa fürsət tapmış kimi yenə başladı..* M.Hüseyn.

**ADƏTKƏR** [*ər.* adət və *fars.* ...kar] b a x **adətkərdə.**

**ADƏTKƏRDƏ** *sif.* [*ər.* adət və *fars.* ...kərdə] Adət etmiş, vərdiş etmiş, alışmış, öyrəşmiş. [Fərhad:] *Lələ, qəlyandan, çubuqdan, papirosdan bir şeyə adətkərdəsinizmi?* Ə.Haqverdiyev. □ **Adətkərdə olmaq** – alışmaq, vərdiş etmək, adət etmək, öyrəşmək, adəti olmaq. *Bir-biri ilə dalaşıb boşanmağa məhz adətkərdə olmuşlar.* C.Məmmədquluzadə. *Bu adamlara həmişə hörmət etməyə adətkərdə olmuş Balacayev onların sözünü sındırmırdı.* S.Rəhimov.

**ADƏTKƏRDƏLİK** *is.* Adət etmə, vərdişlik.

**ADHEZİYA** *is.* [*lat.*] İki müxtəlif cinsli bərk və ya maye cismin bir-birinə yapışması.

**ADI** *əd. dan.* Qətiyyən, əsla, heç, yerlidibli. *Bu işdən adı xəbərim yoxdur. Bundan sonra adı sizə ayaq basmayacağam.*

**ADIBƏDNAM** *dan.* b a x **bədnam.**

**ADIBƏDNAMLIQ** *dan.* b a x **bədnamlıq.**

**ADIBİLİNMƏZ** *sif.* Adı bəlli olmayan, öz adını gizli saxlayan, adı məlum olmayan. *Bu adıbilinməz adam öz ərizəsinə görə, yoxsa budka ləğv edildiyinə görə tutduğu vəzifəsindən azad edilibdir?* “Kirpi”.

**ADIGEY** *is.* Şimali Qafqazda xalq adı. *Adıgeylərin xalq poeziyası.*

**ADIGEYCƏ** *sif.* və *zərf* Adıgey dilində.

**AD(I)NA** *is.* Cümə axşamı, həftənin dördüncü günü. *Adna günü. Adına axşamları. – Burada oğlan anası qudasına cavab verəcək ki, biz adına günü toy başlayırıq.* R.Əfəndiyev.

**ADINALIQ** *is. məh.* Ölən adam üçün cümə axşamı günləri verilən ehsan.

**ADIVAYQANLI** *is. dan.* Haqsız olaraq hər bir pis iş isnad edilən adam.

**ADİ** *sif.* [*ər.*] 1. Adət halına keçmiş, gündəlik, hər vaxtkı. *Adi hal. Adi işlər. Adi qayda.* // Həmişəki. *Ən çətin zamanlarda Əsgər kişi öz kitabxanasını adi səliqəsi ilə saxlamışdı.* Mir Cəlal. *Günəş qalın buludları yırtıb hər tərəfə işıq saçanda, artıq motor adi yeknəsəq səsi ilə fırlanırdı.* M.Hüseyn.

2. Sadə, başqalarından fərqlənməyən. *Adi şey. Adi adam. Adi geyim. – İndi respublikamızda vaxtı ilə adi fəhlə olmuş yüzlərlə alim və mütəxəssislər, ixtiraçılar vardır.* İ.Əfəndiyev.

**ADİL** *sif.* [*ər.*] Ədalətli, düz iş görən. *Tənimdə qalmayıb bir xali yer qəmzən xədəngindən; Olur abad hər mülkün ki, adil olsa sultanı.* Q.Zakir. *Qurban otuz səkkiz, ya qırx yaşında bir ağıllı, doğru və adil bir adam idi..* İ.Musabəyov.

**ADİLANƏ** *zərf* [*ər.* adil və *fars.* ...anə] Adilcəsinə, ədalət üzrə, ədalətlə, insafla.

**ADİLƏŞDİRİLMƏ** “Adiləşdirilmək”dən *f.is.*

**ADİLƏŞDİRİLMƏK** *məch.* 1. Adi hala salınmaq.

2. Bəsitləşdirilmək, sadələşdirilmək; bayağılaşdırılmaq.

**ADİLƏŞDİRMƏ** “Adiləşdirmək”dən *f.is.*

**ADİLƏŞDİRMƏK** *f.* 1. Adi hala salmaq.

2. Bəsitləşdirmək, sadələşdirmək; bayağılaşdırmaq. *Mövzunu adiləşdirmək.*

**ADİLƏŞMƏ** “Adiləşmək”dən *f.is.*

**ADİLƏŞMƏK** *f.* 1. Adi şəklə düşmək, həmişəki kimi olmaq.

2. Bəsitləşmək, sadələşmək; bayağılaşmaq.

**ADİLİK** *is.* 1. Adi şeyin halı. *Qız etiraz etdi: – Söhbətlərimizdə adilik yoxdur.* M.S.Ordubadi.

2. Bəsitlik, sadəlik, bayağılıq.

**ADİLLİK** *is.* Ədalətlilik, ədalət.

**ADİNƏ** [*fars.*] b a x **adına.**

**ADQOYDU, ADQOYMA** *is.* Uşağa ad verilməsi münasibətilə düzəldilmiş ziyafət. *Adqoydu günü. Adqoyma bayramı* (bir adamın adqoyma günü münasibəti ilə edilən bayram).

**ADLAMA** "Adlamaq"dan *f.is.*

**ADLAMAQ** b a x **addamaq.** *Nalqıran dağları adlayıb aşarkən; Məni də alınız, uçayım dağlara; Könlümdə nə varsa açayım dağlara*. M.Müşfiq. *Qız kəndə gedən cığıra adlayaraq dağa qalxdı.* Ə.Sadıq. [Qəhrəmani] *vağzalın böyük binasından keçib relslərin üstündən adlayaraq, depoya tərəf getdi.* M.İbrahimov.

**ADLANDIRILMA** "Adlandırılmaq"dan *f.is.*

**ADLANDIRILMAQ** "Adlandırmaq"dan *məch. Görülmüş iş əla bir iş adlandırıla bilməz.*

**ADLANDIRMA** "Adlandırmaq"dan *f.is.*

**ADLANDIRMAQ** *f.* 1. Ad qoymaq, ad vermək, ləqəb qoymaq. *Bütün el onu şair atası adlandırırdı. Yoldaşları onu qorxaq adlandırdılar.*

2. Adını çəkmək, adını dilinə gətirmək. *Naməlsəm məhəlləsində böyükləri öz adları ilə adlandırmaq eyibli bir şey hesab olunurdu.* N.Nərimanov.

3. Səciyyələndirmək, qiymətləndirmək. *Bu hərəkəti heç bir vaxt yaxşı bir hərəkət adlandırmaq olmaz. Bu işi necə adlandıraq?* – [Qəhrəman:] *Sükut deyirəm, səhv etməyiniz. Onu ancaq o vaxt sakitlik adlandırmaq olardı.* H.Nəzərli.

**ADLANMA** "Adlanmaq"dan *f.is.*

**ADLANMAQ** *f.* Müəyyən ad daşımaq, müəyyən adı olmaq. *Hər şey öz adı ilə adlanmalıdır.*

**ADLANMA(N)C** *is. məh.* 1. Dar dərə, çay və yarğanlar üzərindən atılan kiçik körpü.

2. Çəpər yolu, çəpərin üstündən keçən yol.

**ADLI** *sif.* 1. Müəyyən adı olan, ...adında. *Birdən tələbələrdən Merac adlısı bərkdən qışqırdı.* Ə.Vəliyev. *Komandir, Əliyev adlı bir azərbaycanlı kapitan idi.* Mir Cəlal.

2. Məşhur, adlı-sanlı, adı çıxmış, tanınmış. *Ölkəmizin adlı alimləri*. – *Bundan əvvəl bu gözəl ölkədə canlar var idi; Yaxşı-yaxşı qocalar, adlı cavanlar var idi.* M.Ə.Sabir. [Mirzə:] *Buradan neçə nəfər adlı xanəndələr çıxıbdır.* Ə.Haqverdiyev. *..Bayandır xan misilsiz bir bayram şənliyi qurmuş, sağında, solunda .. adlı cəngavərlər, hünərli ərlər durmuşdular.* M.Rzaquluzadə.

**ADLIQ: adlıq hal** *qram.* – kim, nə sualına cavab olan hal.

**ADLI-SANLI** *sif.* 1. Hər hansı bir sahədə öz fəaliyyəti ilə ad qazanmış, tanınmış, şöhrət tapmış. *Ölkəmizin adlı-sanlı adamları. Adlı-sanlı buruq ustaları.* – *Böyük qızını adlı-sanlı bir mühəndis görən Nərgiz xanım kiçik qızı Ulduzu da həkim görmək arzusunda idi.* Ə.Məmmədxanlı. [Elçin:] *Sən gənc bir vətəndaşsan, bu gün-sabah isə adlı-sanlı bir usta olacaqsan.* Z.Xəlil. *Yurdun hər bucağından adlı-sanlı pəhləvanlar .. axışıb gəlmişdi.* M.Rzaquluzadə.

2. *köhn.* Keçmiş zamanda zadəgan, varlı və imtiyazlı təbəqələrə mənsub olan. *Adlı-sanlı nəsil.* – [Süleyman:] *Ancaq bir iş var ki, qohum olanda gərək elə olasan ki, sənə yaraşan ola, özü də varlı ola, adlı-sanlı ola.* Ü.Hacıbəyov.

**ADMİRÁL** *is.* [*ər.* əmirülbəhr – "dəniz əmiri" sözündən] Bütün dövlətlərdə qəbul edilmiş hərbi dəniz donanmasında yüksək rütbə. *Admiral Naximovun vaxtından bu sahillərə düşmən gəmisi yan ala bilməmişdi.* M.Hüseyn. *Çək lövbəri, sür gəmini, dənizə yol al; Keşik çəkək sərhədlərdə, yoldaş admiral!* Ə.Cəmil.

**ADMİRALLIQ** *is.* 1. Admiral rütbəsi.

2. *köhn.* Hərbi donanmanı idarə edən ali orqan.

**ÁDRES** [*fr.*] 1. Bir şəxsə, ya idarəyə göndərilən məktub və s.-nin üstündə həmin şəxsin yaşadığı, yaxud idarənin olduğu yeri və adını göstərən yazı; ünvan.

2. Bir şəxsin yaşadığı və ya bir idarənin olduğu yer; ünvan. *Ancaq yaxşı düşün, yaxşı fikirləş! Adresim də budur... bizə gəl sabah.* M.Müşfiq.

3. Yubiley münasibəti ilə, yaxud başqa bir münasibətlə bir şəxsə, ya idarəyə kollektiv və s. tərəfindən təqdim edilən təbriknamə, müraciətnamə.

**ADRESÁT** [*fr.*] Adına məktub, teleqram və s. göndərilən şəxs.

**AD-SAN** *is.* Nüfuz, şöhrət, etibar, hörmət, şan, yaxşı ad. *Ol keçən dəmləri hanı Zakirin; İtkin olub adı-sanı Zakirin.* Q.Zakir. *Əsrin caynağında yumaqdı ad-san; Gecə pəncərəmə dırmaşan pişik!* M.Araz. [Hacı Kazım:] *Ə, sənin mahalda adın var, sanın var, balam, bu nə işdir?* S.Rəhimov. ☐ **Ad-san qazanmaq (çıxarmaq)** – yaxşılıqda şöhrət

qazanmaq, məşhur olmaq, ad qazanmaq. [Namaz:] *Əvvələn, malınız, pulunuz artar, ikinci ad-san çıxardarsınız.* M.F.Axundzadə.

**ADSIZ** *sif.* 1. Adı olmayan. *Adsız ada. Adsız yerlər.* // Adı məlum olmayan. *Deyir yana-yana adsız bir cisim: Günəş haqqımızı tapdayır bizim!* M.Araz.

2. Şöhrəti, adı-sanı olmayan, tanınmayan. *İgid cavanlar bəxtini burada sınar, adsızlar burada ad qazanardı.* M.Rzaquluzadə.

3. İmzasız. *Adsız məktub.*

◊ **Adsız barmaq** – əldə orta barmaq ilə çeçələ barmaq arasındakı barmaq.

**ADSIZLIQ** "Adsız"dan *mücər*.

**ADSIZ-SANSIZ** *sif.* Adı-sanı olmayan, tanınmayan, heç bir cəhətdən məşhur olmayan, adi. *Adsız-sansız adam. – Amma indi ikinci dəfə onu xəcil edən bu adam o vaxtkı adsız-sansız odunçu oğlu deyildi, xalqın sevimlisi idi və yüzlərlə havadarı vardı.* Ə.Məmmədxanlı.

**ADVOKÁT** *is.* [*lat.*] *hüq.* Məhkəmədə bir tərəfə xidmət göstərən hüquqşünas. b a x **vəkil** 2-ci mənada. *Sat var-yoxunu, advokata ver neçə xələt; Puç ol hələ-hələbət.* M.Ə.Sabir. *Çox yazmaq yazıçı peşəsidir, çox kitab oxumaq bikar advokatların və dərin həkimlərin sənətidir*. C.Məmmədquluzadə. *Advokat Əlabbas bəy kabinəsində əyləşib çay içirdi.* Ə.Haqverdiyev.

**ADVOKATLIQ** b a x **vəkillik**. *Rusiyada övrətlərə izn var idi ki, teleqrafxanalarda və dəmiryollarda qulluq etsinlər. İndi onlara ixtiyar verilib ki, vəkillik, yəni advokatlıq etsinlər.* "Əkinçi".

**ADYÁL** *is.* [əsli *rus.*] Yun və ya iplikdən toxunma birqat yorğan. *Nəriman gah adyal üstünə atılmış sədəfli tara, gah bu saat ayrılmalı olduğu babasına baxır..* Mir Cəlal. [Kəyan] *oturduğu yerdən adyal döşənmiş tirədə uzanıb, şinelin altında yatan Mədədin çiynini silkələdi.* Ə.Əbülhəsən.

**ADYUTÁNT** *is.* [əsli *lat.*] *hərb.* Hərbi hissə komandirinin tapşırığını icra edən, yaxud qərargah işlərini icra edən hərbi qulluqçu. *Qara, Çernışevin adyutantına da yer göstərdi.* Ə.Əbülhəsən.

**ADYUTANTLIQ** *is.* Adyutant vəzifəsi və işi.

**aero...** [*yun.*] Mürəkkəb sözlərin əvvəlində həmin sözlərin havaya, havada uçuşa, aviasiyaya aid olduğunu bildirir; məs.: aerologiya, aeroplan, aerostat.

**AERODİNAMÍK** *sif.* Aerodinamikaya aid olan, xas olan. *Aerodinamik tədqiqat. Cisimlər havada hərəkət etdikdə aerodinamik qüvvə əmələ gəlir.*

**AERODİNÁMİKA** [*yun.*] Havanın və digər qazların hərəkətindən, habelə qazların, onların içində olan cisimlərə təsirindən bəhs edən elm.

**AERODRÓM** [*yun.*] Təyyarələrin və ya başqa uçucu aparatların havaya qalxması, enməsi və durması, habelə onların uçuşunu təmin etmək üçün müvafiq tikililəri olan meydança.

**AEROFOTOQRÁFİYA** [*yun.*] Təyyarədən bir yerin fotoşəklini çəkmə. *Aerofotoqrafiya hava kəşfiyyatında xüsusilə əhəmiyyətli rol oynayır.*

**AEROXİZƏK** *is.* [*yun.* aero və xizək] Propeller vasitəsilə hərəkət edən xizək.

**AEROKLÚB** [*yun.* aero və *ing.* klub] Təyyarəçilik ilə maraqlanan və ya məşğul olan şəxslərin ictimai təşkilatı (klubu). *Aeroklub təyyarəçilik mədəniyyətinin gözəl idarələrindən biridir. – Əli aerokluba yola düşər, Gülnaz Alya ilə teatra gedərdi.* S.Rəhimov.

**AEROLÓGİYA** [*rus.*] Havanın üst təbəqələrinin fiziki, kimyəvi və başqa xassələrini tədqiq edən elm.

**AERONÁVT** [*rus.*] Uçucu aparatlarda havaya uçan adam.

**AERONÁVTİKA** [*yun.*] Uçucu aparatlarda havada hərəkət etmə nəzəriyyə və praktikası.

**AEROPLÁN** [*fr.*] b a x **təyyarə**. *Qəzəl olmasaydı guya İranda; İndi biz uçardıq aeroplanda.* Şəhriyar.

**AEROPÓRT** [*yun.* aero və *lat.* port] Nəqliyyat təyyarələrinin müntəzəm uçuşlarını təmin etmək üçün lazım olan tikinti və avadanlıqla təchiz edilmiş böyük aerodrom. *Bakı aeroportu*.

**AEROSƏPİN** *is.* [*yun.* aero və səpin] *k.t.* Alçaqdan uçan təyyarələr vasitəsilə səpin.

**AEROSTÁT** [*rus.*] Balonun içində olan qazın qaldırıcı qüvvəsi sayəsində havaya

qalxan havadan yüngül uçucu aparat; hava balonu. *Noyabrın 28-də Parij şəhərində bir neçə elm sahibi aerostat, yəni şar ilə havaya qalxıblar ki, elm imtahanı etsinlər, amma aerostat cırıldığına 230 metr hündürlükdən yerə yıxılıblar və 8 adamdan 5-i bərk yaralanıb.* "Əkinçi".

**AFAQ** *is*. [*ər*. "üfüq" söz. cəmi] *şair*. 1. Üfüqlər. *Məhtab bir şəb idi, hava mişkbar idi; Afaqə nur axardı, səma ləməzar idi.* M.Hadi. *Hökmfərmadır onda sümtü sükut; Sarmış afaqını dumanlı bulud.* A.Səhhət.

2. *məc*. Aləm, dünya, ölkələr mənasında. *Afaqə düşdü ğülğülə hüsnündən, ey qəmər.* Nəsimi. *Rüsvayi-zəmanə oldu məndən; Afaqə fəsanə oldu məndən.* Füzuli. [Şeyx Hadi:] *Tutsa afaqı şöleyi-hikmət; Onu duymaz dumanlı gözlər, əvət.* H.Cavid.

**AFAT** *is*. [*ər*. "afət" söz. cəmi] b a x **afət** 1-ci mənada. [Nəsib:] *Mat-məəttəl qalmışam ki, bu nə bəladı, nəzərdi, gözdü, afatdı .. nədi, bilmirəm!* Mir Cəlal. ☐ **Afat vurmaq** – təbii fəlakətə uğramaq, dolu vurmaq və s. **Afat aparsın səni, afat aparmış** – qarğış.

**AFƏRİN** *nida* [*fars*.] Tərif, təhsin ifadə edir; əhsən, mərhəba. *Afərin sənə, oğlum! Afərin sizə, yaxşı işlədiniz! – Afərin hüsnünə ey fitneyi-dövran, bəri gəl.* Nəsimi. [Abbas:] *Afərin, bacım Zeynəb, indi otur, bunları dəstə tutaq..* S.S.Axundov. *Öz yaşından böyük iş görənlərin; Bir afərin söylə hünərlərinə.* Ə.Cavad. *İkinci pərdə düşdükdən sonra camaatdan, yoldaşlarım və teatrda iştirak edənlər başıma yığılıb: – Afərin! Afərin! – deyə məni təbrik etdilər.* H.Sarabski. // Bəzən kinayə və istehza yolu ilə deyilir. *Afərin sənin hünərinə. Afərin sənə, bizi yaxşı aldatdın! – Afərinlər, doğru yollu verdiyin peymanlara; Əhdini ifa üçün sadir olan fərmanlara...* M.Ə.Sabir.

**AFƏT** *is*. [*ər*.] 1. Bəla, fəlakət, bədbəxtlik, müsibət, ziyan, zərər. [Şah:] *Pədərsuxtə, kəvakibin afətindən məni qorxudarsan və əlacını gizlərsən?* M.F.Axundzadə. *Uşaqlarınıza heç bir cəhətdən afət yetməyəcək.* C.Məmmədquluzadə. // *məc*. Adam haqqında. *Biri N. qəzasının afət və bəlası sabiq prokuror İvanov idi.* Ə.Haqverdiyev. // Məc. mənada. *Arizuyi-vəsli-canan canə afətdir, könül!* Füzuli.

2. *məc. şair*. Son dərəcə gözəl qız, qadın, dilbər haqqında. *Harda qalmış görəsən, ol dəli, məcnun feyzi; Dur yügür, gəl, dediyin afəti-dövran gəldi.* Nəbati. *Bu afəti birinci görüşdə sevməmək qabil deyildi.* M.S.Ordubadi. *Gülzar altı-yeddi ay bundan əvvəl deyər, gülər, çalar, oynar şux bir afət idi.* C.Cabbarlı.

3. *məc*. Çox zirək, çox cəld; od-alov. *O, uşaq deyil, afətdir!*

**AFƏTZƏDƏ** *sif*. [*ər*. afət və *fars*. ...zədə] Bəlaya, müsibətə uğramış, fəlakətə düçar olmuş.

**AFFAYI** *zərf* [*fars*.] *dan*. Havayı, nahaq, boşuna, əbəs.

**AFFÉKT** [*lat*. affectus – ruhi həyəcan] İnsanın əhvaldan və ehtirasdan fərqli olaraq güclü, coşqun baş verən və nisbətən qısamüddətli olan emosional həyəcanı, qəzəbi, dəhşəti və s. *Affektin aradan qaldırılması xeyli dərəcədə iradə gücü tələb edir.*

**AFFRİKÁT** *is*. [*lat*.] *dilç*. İki samitin qovuşmasından yaranan yeni samit; məs.: rusca ц (t + s) və ч (t+ş).

**AFÍŞA** [*fr*.] Tamaşa, konsert haqqında (divarlara vurulan) elan. *Rüstəm gülüb dedi ki, buna afişa deyərlər, tamaşadan iki-üç gün qabaq yazıb divara yapışdırırlar ki, camaat oxuyub bilsin.* H.Sarabski. *Hüseyn bu afişanın qarşısında donub qaldı.* S.Rəhman.

**AFİYƏT** *is*. [*ər*.] *köhn*. Cansağlığı, sağlamlıq, səhhət. *Ol bəzm idi afiyət bahari; Mən bülbüli-zari-biqərari.* Füzuli. ☐ **Afiyət olsun!** *köhn*. – cansağlığı, sağlamlıq arzusu bildirən ifadə (adətən şərbət, su içənlərə, yaxud asqıranlara deyilir).

**AFORÍZM** *is*. [*yun*.] Dərin mənalı fikri ifadə edən sabit söz birləşməsi və ya cümlə; hikmətli söz. *Nizaminin aforizmləri. Sədinin aforizmləri. Aforizmdə fikrin bitkinliyi və formanın səlisliyi əsas şərtdir.*

**AFORİZMLİ** *sif.* Aforizmlərlə dolu olan. *Nizaminin aforizmli şeirləri.*

**AFRİKALI** *sif.* Afrikada yaşayan, Afrika əhli.

**AFTAB** *is*. [*fars*.] *şair*. Günəş. *Cam içrə mey ki, dairə salmış hübab ona; Ayinədir ki, əks salır afitab ona.* Füzuli. *Novbahari-hüsnü etdikcə tərəqqi ol məhin; Şərm edib hər gün uzaqlardan dolanır afitab.* S.Ə.Şirvani.

**AFTABA** [*fars.*] b a x **aftafa.** *Görürsən ki, elə hey çay başıaşağı o tərəfdə-bu tərəfdə əllərində aftaba və başlarında əmmamə ağalar düzülüb çömbəliblər.* C.Məmmədquluzadə. *Usta Ramazan aftabanı götürüb, bağçadan çıxdı.* M.Hüseyn.

**AFTAFA** *is.* Lüləyi və qulpu olan su qabı; lüləyin. *Səriyyə tas və aftafanı gətirib mübaşir Məmmədin .. əllərinə su tökdü.* M.İbrahimov.

**AFTAFA-LƏYƏN** *is.* Aftafa ilə ləyəndən ibarət yuyunma ləvazimatı. *Yenə aftafa-ləyən gəldi, isti su və sabunla əllər və ağızlar yuyulub silindi.* Çəmənzəminli.

**AGAH** [*fars.*] Xəbərdar. *İnanma gər desə rəmmal sirri-qeybə agahəm; Dəhanın sirrinə yüz kərrə iczin etiraf eylər.* S.Ə.Şirvani. □ **Agah etmək** – xəbərdar etmək, bildirmək. *Olmuya qorxursunuz ki, əyilib camaatın qulağına bir neçə söz pıçıldayam, bir neçə mətləblərdən agah edəm.* C.Məmmədquluzadə. *Zamanı eşikağası işdən agah etdi, biçarə xanın ayağına yıxıldı və gözlərinin yaşını tökdü.* Çəmənzəminli. **Agah qılmaq** – b a x **agah etmək**. *Dedim: cana, məni agah qıl sirri-dəhanından; Dedi: məzur tut, elmi-müəmma aşikar olmaz.* Q.Zakir. **Agah olmaq** – xəbərdar olmaq, bilmək. *Şeir zövqündən olmayan agah; Əhli-nəzmi məzəmmət eyləməsin.* Füzuli. *Əziz başın üçün oxu yazdığım; Agah ol halımdan gahbəgah mənim!* Qurbani. *Ta olmaya kimsə ondan agah; Bu şeri oxurdu əksər ol mah.* Məsihi.

**AGAHLIQ** *is.* Xəbərdarlıq.

**AGÉNT** [*lat.*] 1. Bir idarə və ya müəssisənin tapşırığı və ya vəkaləti ilə iş görən adam, müvəkkil. *Ticarət agenti. Maliyyə şöbəsi agenti. Abunə toplayan agent.*

2. Casus. *Çar xəfiyyəsi agentləri. Düşmən agenti. – ..Çar agentinə və bir casusa yaraşan sifətləri bunun məsum və səmimi çöhrəsinə yaxa bilmirdim.* M.S.Ordubadi. *Agentlər qayığı Qaraşəhər körpüsündə gözləyirmişlər.* A.Şaiq.

**AGENTLİK** *is.* 1. Mərkəzi bir idarə və ya müəssisənin yerlərdə olan şöbəsi, nümayəndəliyi, müvəkkilliyi. *Dövlət bankı agentliyi. Sığorta idarəsi agentliyi.*

2. Qəzetlər üçün məlumat toplamaqla məşğul olan idarə. *Teleqraf agentliyi* (öz müxbirləri vasitəsilə qəzetlərə teleqraf xəbərləri verən idarə).

**AGENTÚRA** [*lat.*] 1. Bir müəssisə, idarə və ya təşkilatın agentləri.

2. Xarici hökumətlərin casus və diversantları. // Casuslar; casusluq.

**AGƏH** *klas.* b a x **agah.**

**AĞ**[1] 1. *sif.* Qar, süd, tabaşir rəngli (*qara* əksi). *Ağ saç. Ağ köpük. – Sona gülümsünüb, ağ əlləri ilə Bahadırın əlindən tutub çəkdi.* N.Nərimanov.

2. *sif.* Təmiz, yazılmamış. *Ağ kağız. Ağ dəftər.*

3. *is.* Gözün buynuz təbəqəsində əmələ gələn ağımtıl ləkə (xəstəlik). *Gözünə ağ gəlmək.*

4. *sif.* və *is.* Gümüş, yaxud ağ metaldan kəsilmiş (pul). *Ağ pul. – Bir cibimdə əsginasım, bir cibimdə ağ manat; Olsun, olsun, qoy çox olsun böylə ləzzətli həyat.* M.Ə.Sabir.

5. *sif. məc. tar.* Sovet hökuməti əleyhinə mübarizə etmiş, əksinqilabçı, ağqvardiyaçı mənasında. *Ağ qvardiya. Ağ zabit. Ağ qoşunlar.* // İs. mənasında cəm şəklində: AĞLAR – ağqvardiyaçılar, əksinqilabçılar.

6. İs. mənasında cəm şəklində: AĞLAR – qaralardan fərqli olaraq, açıq rəngli damalar, ya şahmat fiqurları.

7. İs. mənasında cəm şəklində: AĞLAR – ağ irqə mənsub olanlar, avropalılar.

8. *sif. məc. dan.* İfrat, mübaliğəli, açıqdan-açığa mənasında. *Ağ yalan. Ağ böhtan.* – [Əhməd:] *Axırda bircə dəfə dedim ki, qardaş, bu ağ yalanı nə üçün deyirsən?* Ə.Haqverdiyev. *Yalandır! Ağ yalan! Qara bir hiylədir.* R.Rza.

◊ **Ağ düşmək** – ağ ləkələr düşmək, ağarmağa başlamaq, çallaşmağa başlamaq (saç, saqqal). *Gündə yüz gəz düşə aşüftəlik əhval içinə; Qorxum oldur ki, sabah ağ düşə saqqal içinə.* M.P.Vaqif. **Ağ eləmək** – həddini aşmaq, ifrata varmaq. [Zaman:] *Lap bir belə ağ eləmək olmaz ki!* Ə.Haqverdiyev. [Heybət:] *Canım, bu Xəlil daha lap ağ elədi ki... Bəlkə acığından eləyir?..* M.Hüseyn. **Ağ gecə(lər)** – şimalda işıq gecələr. [İlyas] *qələmi barmaqları arasında bərk sıxaraq, sərin şimal axşamının, başlanmaqda olan ağ gecənin alatoran işığında yazırdı.* Mir

Cəlal. **Ağ gün** *məc.* – xoşbəxtlik, səadət. *Ağ gün ağardar, qara gün qaraldar.* (Ata. sözü). *Xalın qaradı, zülf qara, gözlərin qara; Bir ağ gün görərmi olan mübtəla sana?* S.Ə.Şirvani. **Ağ gün ağlamaq** – xoşbəxtlik axtarmaq, səadət arzulamaq. [Fərhad:] *Mənim xeyirxahlarım mənə gəlin gətiriblər, mənə ağ gün ağlayıblar.* Ə.Haqverdiyev. *Ata oğluna bir ağ gün ağlamaq istəyirdi.* S.Rəhimov. **Ağ günə çıxmaq** – xoşbəxt olmaq, xoşbəxt həyat keçirmək, ehtiyacdan qurtarmaq. [Ağabəyim qızına:] *Sən elə bilirsən, ərə gedən ağ günə çıxar?..* Çəmənzəminli. **Ağ kömür** – su-elektrik stansiyalarında elektrik enerjisinə çevrilən çay sularının hərəkət qüvvəsi. **Ağa ağ, qaraya qara demək** – düzünü demək, həqiqəti olduğu kimi demək. [Rüstəm:] *O kişi ağa ağ, qaraya qara deyən idi.* S.Rəhimov. **Ağı qaradan seçməmək** – yaxşını yamandan ayıra bilməmək. *Mehri-rüxsarını dil mahisəmadan seçməz; Etibarı yox onun ağı qaradan seçməz.* S.Ə.Şirvani. **Ağına-bozuna baxmamaq** – yaxşı-yamanına baxmamaq, ayırd etməmək, heç bir şeyi nəzərə almamaq, heç bir şeylə hesablaşmamaq; necə gəldi, ucdantutma. *Budu xahişləri kim, baxmayıb ağı-bozuna; Eyləyim həcv tamam bəyü gədavü xani.* Q.Zakir. *Bu səbəbdən* [Bülənd] *dərhal ağına-bozuna baxmayaraq, .. nimdər üstündə oturub yastığa söykəndi.* Ə.Əbülhəsən.

**AĞ²** *is.* 1. Ağ rəngli bez və s. parça. *Köynəklik ağ. Mələfəlik ağ. Ağdan tikilmiş köynək. Bir top ağ. – Gün əyiləndə Ağcagilin darvazasından üzünə nimdaş bir ağ çəkilmiş uşaq tabutu çıxardılar.* Mir Cəlal.

2. *dan.* Kəfən.

**AĞ³** *is.* Tor. *Dağ maralı kimi sərsəm gəzən yar; Axır rast gələrsən sən ağa qarşı.* Aşıq Fətəli.

**AĞ⁴** [*ər.*]: **ağ olmaq, üzünə ağ olmaq** – itaət etməmək, söz qaytarmaq, tabe olmamaq. [Gülsənəm:] *Atamı da, xanın üzünə ağ olduğuna görə üç gün bundan qabaq boğazından asdılar.* Ə.Haqverdiyev. *Tövbə... Ey mollanümalar, sizə ağ olmağıma; Çox təəssüf edirəm sizdən uzaq olmağıma.* C.Cabbarlı. *Böyüyə ağ olanın gözünə ağ düşər, – deyə Quliyev də atalar sözü ilə cavab verdi.* Ə.Sadıq.

**AĞA** *is. köhn.* 1. Hakim, istismarçı siniflərə mənsub adam; mülkədar, bəy, zadəgan. [Kəndli:] *Biz ata-babadan ağa qulluğunda oturmağa adət etməmişik.* Ə.Haqverdiyev.

2. Keçmişdə seyidlərə, ruhanilərə verilən ləqəb. // Keçmişdə ziyalılara müraciət edərkən söylənilirdi; cənab. // Keçmişdə mənsəb sahiblərinə, yaxud yaşlı və hörmətli adamlara verilən ləqəb (bəzi adamların adlarının əvvəlinə, ya axırına əlavə olunardı). *Novruz Bahadırı qəmgin görüb dedi: – Ağa, nə üçün fikir edirsən? Yoxsa qaçaqlardan qorxursan?* N.Nərimanov. [İskəndər:] *Doğru deyir ağa, onlar heç vaxt özlərini bu ağzıbirə salmazlar.* N.Vəzirov. [Nəcəf bəy:] *Ağa İmamverdi, hirsini bas, mən ona qulaqburması verərəm.* Ə.Haqverdiyev. // *dan.* Keçmişdə uşaqlar atalarına deyərdilər.

3. Sahib, sahibkar, yiyə, hakim. *Bu yerlərin ağası zəhmətkeşlərdir. – İnsan bütün varlığın ağasıdır, hakimidir.* M.İbrahimov.

4. *sif.* Hakim, üstün. *Portuqaliyalılar Anqolanı işğal etdikləri ilk gündən .. ağa dil və məhkum dil siyasətini dar ağacı və qılınclarla həyata keçirməyə başladılar.* R.Rza.

**AĞABACI** *is. dan. məh.* Böyük qardaş, dayı və başqa qohumların arvadlarına hörmət üçün verilən ad.

**AĞAC** *is.* 1. Budaqları və bərk gövdəsi olan çoxillik bitki. *Armud ağacı. Qoz ağacı. Ağac əkmək. Qollu-budaqlı ağac. – Ağac bar gətirdikcə başını aşağı dikər.* (Ata. sözü). // Oduncaq.

2. Ağacdan hazırlanan tir, dirək, taxta, şalban və s. *Tikinti üçün xeyli ağac gətirilmişdir. Ağac ehtiyatı.*

3. Ələ götürülən əsa. *Əfsus, qocaldım, ağacım düşdü əlimdən; Səd heyf cavanlıq.* M.Ə.Sabir. *..Ay-vay eləyə-eləyə və öskürə-öskürə rəngi qaçmış bir kişi əlindəki ağaca söykənə-söykənə girir içəri.* C.Məmmədquluzadə. // Dəyənək, çomaq. *Ağacla vurmaq.* ☐ **Əl ağacı** – yeriyərkən dirənmək üçün əldə tutulan ağac; əsa.

4. *köhn.* Təxminən 6-7 kilometrə bərabər uzunluq ölçüsü. *..Kənd ilə pələngin arası təxminən bir ağac olardı.* A.Şaiq.

◊ **Ağaca dönmək** – 1) bərkimək, qurumaq, sərtləşmək; 2) hərəkətsiz hala gəlmək, hissizləşmək, hissini itirmək. **Ağac-ağaca qoymaq (gəlmək)** – dalaşmaq, dava eləmək. *Ata oğul ilə, qardaş qardaş ilə köçmək üstündə ağac-ağaca qoyar və çəkişərdi.* S.Rəhimov. **Uruq ağacı** – b a x **uruq.**

**AĞACAN** *is. köhn.* Ataya, yaxud böyüyə hörmət və nəvazişlə müraciət. *Odur ki, Qurban həmişə fürsət tapanda deyirdi ki, ağacan, qurban olum, belə işləri eləmə.* İ.Musabəyov.

**AĞACATMA** *is. köhn.* 1. Əl ağacı kimi bir ağacla oynanılan oyun adı.

2. Keçmişdə qoyun satdıqda, seçmə olmasın deyə, sürünün içinə ağac atıb, onun bir hissəsini ayırma.

**AĞACAYAQ** *is. köhn. məh.* 1. Ayaqlarına qarmaqlı ağaclar taxıb gəzən oyunbaz.

2. Qılçası olmadığı üçün ağacdan qayrılmış süni ayaqla gəzən adam; axsaq.

3. *məc*. Uzundraz adam.

4. *zool.* Su kənarında yaşayan uzunayaq bir quş.

**AĞACDEŞƏN, AĞACDƏLƏN** *is. zool.* Ağac koğuşlarındakı cücülərlə qidalanan uzun, sərt dimdikli quş. *O namərddir, qorxur hələ; Cəsədinə yaxın gələ; Baltasızdı ağacdələn... Palıd, səni kim yıxdı?* M.Araz.

**AĞACDOĞRAYAN** *sif.* Kəsilmiş ağacları doğramaqla onlardan taxta-şalban hazırlayan. *Ağacdoğrayan zavod.*

**AĞACKƏPƏNƏYİ** *is. zool.* Ağaclara ziyan vuran kəpənəyə oxşar cücü.

**AĞACQURBAĞASI** *is. zool.* Həyatının çoxunu ağacda keçirən yaşıl rəngli kiçik qurbağa.

**AĞACQURDU** *is. zool.* Ağacların içərisində yaşayan zərərverici (cücü).

**AĞACLAMAQ** *f.* Ağacla vurmaq.

**AĞACLAŞMA¹** "Ağaclaşmaq¹"dan *f.is.*

**AĞACLAŞMA²** "Ağaclaşmaq²"dan *f.is.*

**AĞACLAŞMAQ¹** *qarş.* Bir-birini ağacla vurmaq, ağacla vuruşmaq.

**AĞACLAŞMAQ²** *f.* Ağac kimi bərkimək, sərtləşmək. [Bitkinin] *toxumları yetişəndə qozaları ağaclaşır və ya giləmeyvə şəklini alaraq ətlənir.* H.Qədirov.

**AĞACLI** *sif.* 1. Ağacı olan, ağacı çox olan. *Ağaclı yer. Ağaclı dərə.*

2. Əlində ağac olan. *Ağaclı adam. Əli ağaclı.*

**AĞACLIQ** *is.* 1. Çoxlu ağac bitmiş yer, meşəlik yer. *..Buradan dönüb baxanda ağaclıqlar içində qərq olan kənddən heç bir şey görmürsən.* Mir Cəlal. *Darısqal bir daxma var; Qabağı ağaclıqdır.* M.Seyidzadə.

2. *Sif. mənasında.* Ağacları çox olan. *Ağaclıq yerlərdə yağış çox yağar.*

3. Saylarla bərabər – b a x **ağac** 4-cü mənada. *Mənim adətimdir, bir yerdə dustaqxana adı gələndə, gərək iki ağaclıqdan qaçam, yox olam.* C.Məmmədquluzadə. *Ərəb əmiri Əbü-Müslim Dağıstan tayfalarına buyurdu ki, Xəzər tacirlərini şəhərin bir ağaclığında saxlayıb alver etdikdən sonra geri qaytarsınlar.* A.Bakıxanov.

4. *is. məh.* İri güllü, tikanlı bir ot adı.

**AĞACMİŞARLAYAN** *sif.* Mişarla ağac kəsən, yaxud ağacdan taxta kəsən. *Ağacmişarlayan zavod.*

**AĞACOVAN** *is. zool.* Ağac oduncağını və qabığını ovub deşən, sürfəsi olan böcək.

**AĞAC-UĞAC** *top. dan.* Ağaclar, bir şeyin ağaclardan ibarət olan qismi. *Ancaq yağlı dillər tökən Sarımsaq oğlunu neçə gün sonra görməyən Qaçaq Nəbi ağ çadırı söküb, ağac-uğacına qədər pöhrəlikdə gizləmişdi.* S.Rəhimov.

**AĞACVARİ** *sif.* Ağacaoxşar, ağac kimi.

**AĞADADAŞ** *is. dan. məh.* Kiçik qardaşların böyük qardaşa, yaxud keçmişdə gəlinlərin böyük qayınlarına hörmət üçün verdikləri ad.

**AĞADAYI** *is. dan. məh.* Böyük dayıya hörmət üçün verilən ad.

**AĞAƏMİ** *is. dan.* Böyük əmiyə hörmət üçün verilən ad.

**AĞALANMA** "Ağalanmaq"dan *f.is.*

**AĞALANMAQ** *f.* 1. Qeyri-qanuni yolla sahib olmaq, yiyələnmək, əlinə keçirmək, zəbt etmək.

2. *dan.* Özünü ağa kimi göstərmək, lovğalanmaq. *Ona bax, nə ağalanır.*

**AĞALIQ** *is.* 1. Hakimiyyət, hökmranlıq. // Böyüklük, başçılıq. ☐ **Ağalıq etmək** – hakimiyyət sürmək, hökmranlıq etmək. *Hər əli silah tutan aləmə ağalıq etmək istəyirdi.* Mir Cəlal. // Üstünlük, nüfuz.

2. *köhn.* Ağaya (bəyə, mülkədara) məxsus mülk, ev, su, meşə, heyvan və s. [Ayrım qızı:] *İkimiz də cavan idik .. bu çoban idi, mən də ağalığın inəklərini sağar, yağ-pendirini tutardım.* A.Şaiq. *Piri kişinin daxması ağalığın böyük meyvə bağının içində idi.* S.S.Axundov.

**AĞANƏNƏ** *is. dan.* Ailənin ağbirçəyinə, hörmətli qadına verilən ad.

**AĞAPPAQ** *sif.* Tamamilə ağ, lap ağ. *Ağappaq qar kimi. Ağappaq süd kimi. Ağappaq köynək. Ağappaq süfrə. – Ağappaq yollardan elə bil bu an; Ağ mərcan taxıbdır dağlar boynuna.* B.Vahabzadə. *Bacadan burula-burula qalxır; təzə qar kimi ağappaq tüstü.* R.Rza.// Zərf mənasında. *Artıq Ay ağappaq ağarıb sönməkdə idi.* S.Rəhman. *Əfruz bacı ağappaq ağarmışdı.* S.Rəhimov.

**AĞARAN** *f.sif.* 1. Uzaqdan görünən, parlayan (ağ şey haqqında). [Cahandar ağa] *Şahnigarın ağaran paltarından başqa heç nə görmürdü.* İ.Şıxlı.

2. Rəngi tez solan. *Ağaran parça.*

**AĞARANTI** *is.* Süddən hazırlanan məhsullar (qatıq, qaymaq, pendir və s.). *Buranın .. ağarantı satan bazarları başqa şəhərlərə görə qayət zəngin idi.* M.S.Ordubadi. *Bax, odur, tövlədəki sarı düyəni də .. hökumətimiz verib. Sabah, birisi gün uşaqların ağarantısı da çıxacaqdır.* Mir Cəlal. *Dayandıqları ağarantı hazırlanan .. dəhliz kimi bir yerdi.* Ə.Əbülhəsən.

**AĞARDICI** *sif.* və *is.* 1. Ağartmaqla məşğul olan.

2. Ağartmağa yarayan. *Ağardıcı məhlul.*

**AĞARDILMA** "Ağardılmaq"dan *f.is.*

**AĞARDILMAQ** *məch.* 1. Ağ rəngə boyadılmaq, ağ rəng çəkilmək, sürtülmək. *Bayram üçün evlərin divarları ağardıldı.*

2. Üzü köçürülmək, təmiz yazılmaq. *Protokolların üzü ağardılmışdır.*

**AĞARDILMIŞ** *f.sif.* 1. Üzünə ağ rəng (əhəng) çəkilmiş, ağ rəngə boyadılmış. *Divarları ağardılmış otağın küncləri xırda döşəmələrlə döşənərdi.* H.Sarabski.

2. Soldurulmuş.

3. Sürtülüb təmizlənmiş, sürtülüb parıldadılmış. // Qalaylanmış. *Ağardılmış qazança.*

**AĞARIŞMAQ** *f.* 1. Ağarmaq, görünmək (çoxlu ağ şey haqqında); ağarmağa başlamaq. *Dəmir yolundan o yana .. qamışlıqlar arasında balaca gölməçələr ağarışırdı.* M.Hüseyn. *Üfüq yavaş-yavaş ağarışırdı; Tarlada üç dəstə qız yarışırdı.* S.Vurğun.

2. B a x **ağarmaq** 7-ci mənada.

**AĞARMA** "Ağarmaq"dan *f.is.*

**AĞARMAQ** *f.* 1. Ağ olmaq, ağ rəng almaq. *Divarlar əhənglənəndən sonra yaxşı ağardı. Kətan yuyulduqca ağarar.*

2. Qarla örtülmək, qar basmaq. *Qar basmış və ağarıb gedən çöllərdən və təpələrdən başqa bir şey gözə dəymirdi.* M.İbrahimov. *Ağarıbdır düzlər, çöllər; Buz bağlayıb çaylar, göllər.* M.Seyidzadə.

3. Görünmək, öz ağlığı ilə nəzərə çarpmaq (ağ şey haqqında). *Dağların başı ağarır. Uzaqdan bir şey ağarır. – Sadə izlər belə yox daşlarda; Ağ dumanlar ağarır qaşlarda.* S.Vurğun.

4. Yuyulub təmizlənmək, silinib təmizlənmək, parıldamaq, rəngi açılmaq. *Çəngəlbıçaqlar sürtüldükdən sonra ağardı.*

5. Saç və saqqala dən düşmək; çallaşmaq. *Başı ağarmaq. Saqqalı ağarmaq. – Ağardı muyi-sər, qəddin xəm oldu, taqətin getdi; Sənə layiq deyil, Seyyid, belə məşuqəbaz olmaq.* S.Ə.Şirvani.

6. Rəngi getmək, solmaq, bozarmaq. *Parça yuyulan kimi ağardı. Gündən paltarım ağardı.*

7. Açılmağa başlamaq; dan yeri sökülmək, işıqlanmaq. *Gözü üfüqə sataşanda səmanın ağardığını hiss etdi.* Mir Cəlal. *Şərq üfüqləri ağarmağa başlayırdı.* M.İbrahimov.

8. İrinləyib yetişmək (yara, çiban).

9. Yetişib vaxtı ötmək. *..Gömgöy olan bir taxıl, görürsən bir gün çallayıb, bir gün ağarır, vağanıyır, bir azdan tökülür, çürüyür.* S.Rəhimov.

10. *məc.* Üzünün rəngi qaçmaq (qorxudan). *Sərdar Rəşidin üzü qızarır və yenə də ağarırdı.* M.S.Ordubadi.

**AĞARMIŞ** *f.sif.* 1. Ağ olmuş, tamamilə çallaşmış. *Ağarmış baş, saqqal. – Gəldiyev nəzərini kişinin ağarmış saçlarına salmışdı.* Mir Cəlal.

2. Bozarmış, solmuş, rəngi dönmüş, rəngi çevrilmiş. *Ağarmış parça.*

**AĞARTDIRMA** "Ağartdırmaq"dan *f.is.*

**AĞARTDIRMAQ** "Ağartmaq"dan *icb. Divarları ağartdırmaq.* – [Evin qadınları] *mis qab-qacağı qalayçıya göndərib ağartdırar, saxsı qab-qacağı quyu üstə töküb .. pak edərdilər.* H.Sarabski.

**AĞARTI** *is.* 1. B a x **ağarantı**. [Səfər:] *Bu indiki inəyi Ağdamdan gətirmişəm. Kənddə böyümüş adamıq, ağartısız dolanmaq olmur.* Çəmənzəminli. [Almurad:] *Qaldı ağartı məsələsi, o barədə Qızxanımın yaxasından yapış, bu, arvad işidir.* İ.Əfəndiyev.

2. Uzaqdan görünən ağ şey. *Uzaqdan gözümə bir ağartı görünür.*

3. *köhn.* Kirşan. *Bir əldə ağartı, birində daraq; Daranır üstündə muyu çeşmənin.* (Qoşma).

**AĞARTMA** 1. "Ağartmaq"dan *f.is.*

2. *məh.* Çəltiyi dingdə döyüb qabıqdan çıxartdıqdan sonra hasil olan düyü.

3. Üzü təmiz köçürülmüş yazı.

◊ **Göz ağartması vermək** – b a x **göz.**

**AĞARTMAQ** *f.* 1. Ağ rəngə boyamaq, ağ rəng çəkmək. *Divarları ağartmaq. Tavanı ağartmaq. Kətan tufliləri ağartmaq.* // Ağ şeyə sürtüb batırmaq. *Üst-başını divara sürtüb ağartmaq.*

2. Soldurmaq, rəngini qaçırtmaq. *Günün altında çox gəzib paltarını ağartmaq.*

3. Sürtüb təmizləmək, silib təmizləmək, pasını açmaq, sürtüb parıldatmaq. // Qalaylamaq. *Qazanı ağartmaq.* // Təmizləyib düzəltmək, qaydaya salmaq. [Safo] *həmişə Alo ilə birlikdə .. taxıl əkir, balaca xırmanı ağardır, soyuq aylar düşmədən .. dolanıb kəsb etməyə başlayırdı.* S.Rəhimov.

4. Üzünü köçürmək, təmiz yazmaq. *Verdiyev məruzəsinin üzünü on bir dəfə ağartdı, yenə ürəyi qızmadı.* Mir Cəlal.

5. *məc.* Aşkar etmək, açıb demək, üstünü açmaq, ifşa etmək, üzə vurmaq (bəzən "açıb-ağartmaq" şəklində işlənir). [Məmmədvəli:] *..Yola düşdüm, gördüm sovqatımın çoxu gedibdir, bilmədim motalı kim apardı, yağ necə oldu, qaymağı kim yedi.. Heç açıb-ağarda da bilmədim.* N.Vəzirov. *Biri səbəbsiz ağlar; Biri bərk yıxılanda üzə vurmaz, ağartmaz.* R.Rza. [Tapdıq] *qaşlarını çatıb fikirləşdi: "Yaxşı, vursam, deyəcəklər "Aha, oğru sənsən ki?" Yox, açıb-ağartmaq lazım deyil.."* Mir Cəlal.

6. Bir sıra isimlərə qoşularaq mürəkkəb feil və ifadələr düzəldilir; məs.: baş ağartmaq, dişlərini ağartmaq, göz(ünü) ağartmaq, üzünü ağartmaq.

**AĞAYANA** *sif.* və *zərf* 1. Ağa kimi, saymazcasına, amiranə. *..Hacının ağayana səsi daha da ucadan eşidildi: – Hazırla qızı, cümə günü gələcəyəm.* Mir Cəlal.

2. *məc.* Ağa kimi, çox yaxşı. *Bu məvacibə Xəlil nəinki ağayana dolanırdı, hətta bir-iki yüz manatadək də pul cəm edib, Ağahüseynə tapşırığa vermişdi.* Ə.Haqverdiyev.

3. *köhn.* Alicənab. *Ağayana hərəkət.*

**AĞAZ** [*fars.*]: **ağaz etmək** *köhn.* – başlamaq. *Nə taledir bu kim, aləmdə ağaz etmədim bir iş.* Füzuli. *Gündə bir şəbədə ağaz etdin; Çox olan lütfü bizə az etdin.* S.Ə.Şirvani.

**AĞBAĞIR** b a x **ağciyər**.

**AĞBALIQ** *is. zool.* Nərə balığı sinfindən olan çox iri balıq. *Azərbaycan balıqçıları Xəzər sularından qızılbalıq, ağbalıq, nərə, çəki, xəşəm və suf balıqları kimi qiymətli balıqlar tuturlar.*

**AĞBAŞ** 1. *sif.* Başı ağ, başı (saçları) ağarmış. *Ağbaş kişi. Ağbaş arvad. – Qoca, gödək və ağbaş professor dərs deyirdi.* Mir Cəlal.

2. *is. köhn.* Başı əmmaməli, molla, axund. *Hökmdir hakimə, ta hökm edə fərraş arasında; Bölələr yağ-balı fərraş ilə ağbaş arasında.* Şəhriyar. [Tahirzadə:] *Nə etməli, meydanı bu ağbaşlara tərk edib getməlimi, bu meydana yol tapmalımı?* Mir Cəlal.

**AĞBAŞLI** b a x **ağbaş** 1-ci mənada. [Səttar:] *Eybi yox, biz də o ağbaşların qabağına başqa ağbaşlıları çıxararıq..* P.Makulu.

**AĞBƏXT** *sif. dan.* Xoşbəxt, bəxtli, xoşbəxtliyə çıxmış. *Gülpəri satılı su ilə doldurub, Məşədi Püstə bacının başına tökərdi. Məşədi Püstə bacı sözü təzələyərdi: – Ağbəxt olasan! Allah sənə bir halal süd əmmiş yetirsin.* H.Sarabski.

**AĞBƏNİZ** *sif.* 1. Üzü ağ, sifəti ağ. *Ağbəniz uşaq. Ağbəniz qız. – Ağbəniz .. oğlan uşağı çəpiş kimi səkidən atılıb qapıya tərəf gəldi.* Mir Cəlal.

2. Arıq, zəif, solğun sifətli.

**AĞBİRÇƏK** 1. *sif.* Saçı ağarmış yaşlı, qoca, hörmətli (qadın haqqında). [Fatma xanım:] *Məni bu ağbirçək vaxtımda oğru eyləyir.* N.Vəzirov. *Bir az sonra Vaqifin evində olan ağbirçək qadın .. çıxdı.* Çəmənzəminli. *Gözündə kainat başqadır bütün; Gənclikdən zövq alır ağbirçək qarı.* S.Vurğun.

2. *is. məc.* Dünyagörmüş, təcrübəli qadın, yaşlı qadın. *Tükəzbanın bu cür hərəkətlərinə görə kəndin ağsaqqalları onun ərini və atasını çox töhmət edirdilər və ağbirçəklər də onu öz aralarına qoymazdılar.* B.Talıblı. [Şərəbanı:] *Sabahları, deməli ki, əl qaldırıb içimizdən bir ağbirçəyi seçib iş başına qoysaq, qoyarıq.* Mir Cəlal. // Evin, ailənin ən yaşlı və hörmətli qadını. *Ancaq Məryəmin ata-anası oğlan tərəfindən, bir ağsaqqalın və ya bir ağbirçəyin iştirak etməsini tələb edirlərdi.* B.Talıblı. *Evin ağbirçəyi Nubar .. tündməzac, dargöz və deyingən bir qarı idi.* S.Rəhimov.

**AĞBİRÇƏKLİ** b a x **ağbirçək** 1-ci mənada. *Nəzər yetir yurdumuza, min büsat var, cəlal var; Toy paltarı geyinmişdir ağbirçəkli qarılar.* S.Vurğun. *Şəhər tutmur izdihamı; Küçələrə çıxıb hamı: Cavan oğlan, kiçik uşaq; Ağbirçəkli qoca ana.* Z.Xəlil.

**AĞBİRÇƏKLİK** *is. dan.* Böyüklük, başçılıq (qadın haqqında). *Səba yorğan-döşəyə düşdüyündən, Qaraxanın arvadı evin ağbirçəkliyini öz əlinə aldı.* S.Rəhimov.

**AĞCA** *is.* 1. *köhn.* Pul. *Kürə və Misgincə tayfasından on dörd min batman buğda və qırx min dirhəm ağca .. alınıb anbarlara və xəzinəyə yetişirdi.* “Dərbəndnamə”. *Bizim də bolluca ağcamız olar; Qapımız, bağımız, bağçamız olar.* S.Vurğun. *Simuzər dilədim, ağca vermədi.* O.Sarıvəlli.

2. Bəzi balıqların üzərindəki parlaq sədəf kimi pərəklər; pulcuq. *Qumun üzərinə sərilmiş balıqlar, öz ağcalarını parıldada-parıldada .. çapalayırdı.* S.Rəhimov.

**AĞCAQANAD** *is.* Bəzi növləri qızdırma (malyariya) xəstəliyi törədən milçəyəoxşar sancan cücü; ditdili, hünü, mığmığa. *Ağcaqanadla mübarizə. – İsti adamı taqətdən salır, ağcaqanadlar yaşamağa və işləməyə imkan vermirdi.* Ə.Sadıq.

**AĞCAQAYIN** *is. bot.* Möhkəm oduncaqlı, qollu-budaqlı meşə ağacı. *Bir az irəlidə qoşa bitmiş bir cüt ağcaqayın ağacı iki ağ sütun kimi göyə ucalmışdır..* Ə.Məmmədxanlı.

**AĞCAQAYINLIQ** *is.* Çoxlu ağcaqayın ağacı bitən yer, ağcaqayın meşəsi.

**AĞCAQOVAQ** *is. bot.* Yaşıllaşdırma və tikinti işlərində işlədilən ağac növü.

**AĞCALI** *sif.* 1. *köhn.* Pullu, dövlətli, zəngin.

2. Üzərində ağca olan, pullu. *Ağcalı balıq.*

**AĞCALIQ** *is.* İnsanda və heyvanda piqmentsizlik nəticəsində saçın, tükün, dərinin qeyri-normal ağarması; albinizm.

**AĞCAMATAN** b a x **ağmatan**.

**AĞCAMAYA** b a x **ağmaya.**

**AĞCASIZ** *sif.* Üzərində ağca (pul) olmayan. *Ağcasız balıq.*

**AĞCAVAZ(A)** *sif. məh.* Arıq, rəngi solmuş, xəstə, zəif.

**AĞCİYƏR** *sif.* Qorxaq, cəsarətsiz, ürəksiz, aciz. *Ağciyər adam.* – [Məhərrəm:] *Sən nə ağciyər adamsan, Fərhad, qoy bir tamaşa edək, görək Səadət xanımın ruhi-rəvanı necə oğlandır.* N.Vəzirov.

**AĞCİYƏRLİK** *is.* Qorxaqlıq, cəsarətsizlik, ürəksizlik, acizlik. [Kəyan:] *Zərər yoxdur, Qulam, ağciyərlikdən ağsaç olmaq yaxşıdır*! Ə.Əbülhəsən.

**AĞDAŞ** *is.* 1. Tabaşir.

2. Tikintidə istifadə edilən daş növü. *Sonralar .. bir ağdaş yonana şagird oldum; daş yona-yona şikəstə oxuyardım.* H.Sarabski.

**AĞDƏRİLİ** *sif.* və *is.* Dərisinin rəngi ağ olan (adam).

**AĞDİŞ** *is. zool.* Məməlilərin cücüyeyənlər dəstəsinə mənsub, ev siçanından kiçik heyvan.

**AĞGÖZ** *sif. dan.* 1. Qorxaq, cəsarətsiz, ağciyər.

2. *məc.* Şiddətli, qarlı, gecə-gündüz qar yağan. *Qabaqdan da ağgöz qış gəlirdi.* S.Rəhimov.

**AĞGÖZLÜK** *is. dan.* Qorxaqlıq, cəsarətsizlik, ağciyərlik.

**AĞGÜN(LÜ)** *sif. dan.* Xoşbəxt. ☐ **Ağgünlü olmaq** – xoşbəxt olmaq. [Kiçikbəyim Məmməd bəyə dedi:] *Ağgünlü olmuş, məni bu yaşımda gör gətirib haralara çıxarırsan.* Çəmənzəminli.

**AĞI**[1] *is.* 1. Zəhər. *Aşiqə vəfalı bir həmdəm gərək; Həmdəmsiz bal yesə, ona ağıdır.* M.P.Vaqif. *Məni bir məst qıl, saqi, aman ey gözlərin yağı; Şərabın yox, gətir ağı, qulağın niyə kar olmuş?* Nəbati. *Məcnun kimi gəzdim səhranı, dağı; Fələk şərbətimi eylədi ağı.* Aşıq Kərəm. ☐ **Ağıya düşmək** – zəhərli bir şey yeyib zəhərlənmək. **Ağıya salmaq** – heyvanı zəhərli ot olan yerdə otarmaq; insana və ya heyvana zəhərli şey yedirmək, ya içdirmək.

2. *məc.* Çox acı şey haqqında; zəqqum. *Ağzım o qədər acıdır ki, elə bil ağı yemişəm.*

◊ **İlana ağı verən** – b a x **ilan.**

**AĞI**[2] *is.* Köhnə məişətdə: arvadların ölü üstündə, yasda avazla söylədikləri yanıqlı sözlər. *İçəridən ağı səsi gəlirdi.* Çəmənzəminli. ☐ **Ağı demək (oxumaq, çəkmək, tutmaq)** – 1) ölünün üstündə ağız açıb ağlamaq. *Qoca arvadlar ağlaşma qurub, ağı oxumaq istədilər.* M.Hüseyn. *Zavallı ana! Hələ cəmdəkləri soyumayan balaları üstünə döşənib ağı çəkir.* Ə.Əbülhəsən; 2) *məc.* fəğan etmək, fəryad etmək. *Elə bil ağaclar dillənib ağlaşdı, bülbül də öz fəğanı ilə onlara ağı tutdu.* S.Rəhimov.

**AĞIÇI** *is.* Köhnə məişətdə: ağlaşma zamanı ağı söyləyən, ölünü oxşayıb ağlayan qadın. [Şirin:] *Nurcahan, .. əvvəl ki sən ağıçı idin, balam, sonra bu mərsiyəxanlıq nə idi?* N.Vəzirov. *Ağıçının gözəl səsi və nisgilli ağısı adamı mütəəssir edirdi.* Çəmənzəminli. // Ağıya aid olan (b a x **ağı**[2]). *Ədəbiyyat iki qisimdir. Bir qismi ağızda söylənən nəql, hekayətlərdən, cürbəcür milli nəğmələrdən, aşıq sözlərindən, məsəllərdən, tapmacalardan, yanıltmaclardan, ağıçı sözlərindən, bayatılardan ibarətdir.* F.Köçərli.

**AĞIL**[1] *is.* [*ər.*] 1. İnsanda düşünmə və dərketmə qabiliyyəti; zəka. // Şüur, idrak. *Bu növcavan gülüzlü, xoşsifətli olub, ağıl və kamalı üzündən məlum edirdi.* N.Nərimanov. *Ağıl deyir, qalmayacaq yer üzündə qandan əsər; Hər könülə ilham kimi gələcəkdir gözəl səhər.* S.Vurğun.

2. Hafizə, zehin, xatir, yad, yaddaş, fikir. *Ağlımda heç bir şey qalmadı. Ağlıma indi gəldi. Səninlə oxumağım heç ağlıma gəlmir. – Hər kəs ağlına hər nə çatır, əmələ gətirir.* M.F.Axundzadə.

◊ **Ağıl dəryası** – çox ağıllı, çox bilikli, dərin məlumatlı (bəzən zarafat və istehza ilə deyilir). **Ağıl dişi** – b a x **diş. Ağıl eləmək** – baş işlətmək, fikirləşmək, düşünmək, mülahizə etmək, fikirləşib bir yol tapmaq. *Ağıllı ağıl eyləyincə, dəli vurdu Kürü keçdi.* (Ata. sözü). **Ağıl öyrənmək** – başqasından bilik və təcrübə əxz etmək, ibrət götürmək, ibrət dərsi almaq. **Ağıl öyrətmək** – yol göstərmək, iş öyrətmək, nəsihət vermək. *Hər iş adama bir ağıl öyrədir.* (Ata. sözü). **Ağıl vermək** – başına ağıl qoymaq, öyüd vermək, yol göstərmək, pis yoldan uzaqlaşdırmaq. **Ağıl-ağıla vermək** – bir yerdə oturub düşünmək, fikirləşmək, məsləhətləşmək. **Ağıldan kasıb (kəm, naqis)** – axmaq, gic, ağlı az, zehni cəhətdən az inkişaf etmiş. *Eh, ay əmioğlu, sən də məndən beşbetər ağıldan kasıbsan, ha!* M.Hüseyn. **Ağla batmaq (yatmaq)** – inana bilmək, mümkün hesab etmək, inanmaq. *Anasının sözləri Dilarənin ağlına batdı.* M.İbrahimov. *Doktorun sözü ağlıma batdı.* Mir Cəlal. [Bəşir:] *Məsləhətin bəd deyil, ağlıma yatır, anam da məni rahat qoymur.* S.S.Axundov. **Ağla çatmaq** – anlaya bilmək, düşünə bilmək, dərk edə bilmək. **Ağla sığmaq** – inanıla bilmək, mümkün olmaq. **Ağlı azmaq** – 1) dəli olmaq, ağlını çaşdırmaq, ağlını itirmək; 2) sözünü, hərəkətini, işini bilməmək, başdan çıxmaq. **Ağlı (başından) oynamaq** – dəli kimi olmaq, ağlı çaşmaq. **Ağlı ala qayada** – huşu başında olmayan, huşu dağınıq, fikri ayrı yerlərdə olan adam haqqında. **Ağlı başına gəlmək** – 1) özünə gəlmək, ayılmaq; 2) *məc.* ağıllanmaq, pis işdən, avaralıqdan əl çəkib doğru yola düşmək, düzəlmək. **Ağlı başında** – ağıllı, dərrakəli, düşüncəli, öz işini, xeyrini-zərərini bilən adam haqqında. **Ağlı başında olmaq** – öz işi və hərəkətlərində ayıq və dərrakəli olmaq, öz xeyir və zərərini bilmək. **Ağlı başından çıxmaq** – 1) b a x **ağlı başından getmək** – 3-cü mənada; 2) *məc.* bərk hirslənmək, acığı tutmaq. *..Bir gün eşitdik ki, kəndin yaxınlığında pələng üç inək parçalamışdır, ağlım başımdan çıxdı.* A.Şaiq. **Ağlı başından getmək** – 1) ağlını itirmək, ağlını çaşdırmaq, dəli olmaq, sərsəmləmək; 2) *məc.* azmaq, doğru

yoldan çıxıb pis yola düşmək; 3) *məc.* məftun olmaq, vurulmaq, valeh olmaq. **Ağlı çaşmaq** – çaşıb qalmaq, nə edəcəyini bilməmək. [Hacı Həsən:] *Ay arvad, sən Allah, tez ol, durma! Bilmirəm* [Şeyx şəhərin ölülərini] *dirildəcək, ya diriltməyəcək. O bağlıdır ağanın iltifatına. Mənim özümün də ağlım çaşıb; Heç bilmirəm nə cür dirildəcək?* C.Məmmədquluzadə. **Ağlı getmək** – b a x **ağlı başından getmək** 3-cü mənada. **Ağlı kəsmək** – 1) ağlına batmaq, inanmaq, güman etmək, etiraf etmək; mümkün bilmək. *Tükəz xalanın ağlı kəsdi, hər nə fənd olursa olsun kişini qurtarmaq lazımdı.* S.Rəhimov; 2) anlamaq, başa düşmək. [Tapdıq] *xüsusilə üç yaşı tamam olandan və yavaş-yavaş da olsa ağlı kəsəndən sonra daha tələbkar oldu.* Ə.Vəliyev. *Cumanın dediyinə və özünün də ağlı kəsdiyinə görə bu çox gərəkli məlumat idi.* Ə.Əbülhəsən. **Ağlı kəsməmək** – 1) başa düşməmək, dərk edə bilməmək. *Uşaqdır, ağlı kəsmir;* 2) mümkün hesab etməmək, güman etməmək. [Hacı Həsən:] *..Axır ağlım kəsmir ki, gözümüz ilə gördüyümüz işlərin hamısı yalana çıxsın.* C.Məmmədquluzadə. **Ağlı uçmaq** – b a x **ağlı getmək. Ağlı(nı) baş(ın)a yığmaq** – ağıllanmaq, ağıllı olmaq, öz hərəkətini ölçüb-biçmək, fikirləşmək, düşünmək. **Ağlı(nı) uduzmaq** – 1) hiyləyə aldanmaq, uymaq, gözü bağlanmaq; 2) yanılmaq, səhv etmək. **Ağlına çatmaq** – dərk etmək, anlamaq, başa düşə bilmək, xəyalına gətirmək. ..[Hərəmlərin] *ağıllarına çatmırdı ki, Şah Abbas qəflətən bir Abbas Məhəmməd oğlu ola.* M.F.Axundzadə. **Ağlına gətirmək** – yadına salmaq, fikrinə gətirmək, təsəvvürünə gətirmək. *..Heç ağlınıza gətirirsinizmi ki, cümə günü dükanlar bağlı olsa, cavan dükan şagirdləri .. nəyə məşğul olacaqlar?* C.Məmmədquluzadə. [Səriyyə xala] *gələcək qarşısında böyük bir vahimə duysa da, bir gün uşaqlarının bir tikə çörək üçün .. ona-buna əl açacaqlarını heç ağlına da gətirmirdi.* M.İbrahimov. **Ağlını aparmaq** – başdan çıxarmaq, heyran etmək, məftun etmək, valeh etmək. **Ağlını başına cəm etmək** – b a x **ağlını başına yığmaq**. **Ağlını başından çıxarmaq** – 1) azdırmaq, pis yola çəkmək; 2) *məc.* məftun etmək, valeh etmək. **Ağlını itirmək** – 1) dəli olmaq; 2) b a x **ağlı başından çıxmaq.**

**AĞIL**² *is.* İçərisində mal-qara və qoyun saxlamaq üçün ətrafı tikan və ya ağac ilə hasarlanmış üstüaçıq yer. *Qoyunlar sağılıb qurtardıqdan sonra, ağılın ağzını açarkən, ana-bala mələşə-mələşə qaçaraq bir-birinə qarışırdı.* A.Şaiq. *Böyük ağıla doldurulmuş quzular uzaqdan gələn sürünü görüb mələşirdi.* İ.Əfəndiyev.

**AĞILAMA** "Ağılamaq"dan *f.is.*

**AĞILAMAQ** *f.* Ağı vermək, zəhərləmək.

**AĞILANMA** "Ağılanmaq"dan *f.is.*

**AĞILANMAQ** *f.* 1. Zəhərlənmək.

2. *vulq.* Yemək.

**AĞILÇATMAZ** *sif.* Anlaşılmaz, başadüşülməz, dərkedilməz, həlledilməz. *Ağılçatmaz məsələ.*

**AĞILI** *sif.* Zəhərli.

**AĞILKƏSƏN** *sif.* İnanıla bilən, mümkün ola bilən, həqiqətə uyğun olan, ağlabatan. *Ağılkəsən iş.*

**AĞILLANDIRILMAQ** *məch.* Pis yoldan saqındırılmaq, doğru yola sövq edilmək, islah edilmək.

**AĞILLANDIRMA** "Ağıllandırmaq"dan *f.is.*

**AĞILLANDIRMAQ** *f.* Pis yoldan saqındırmaq, doğru yola sövq etmək, düzəltmək, islah etmək.

**AĞILLANMA** "Ağıllanmaq"dan *f.is.*

**AĞILLANMAQ** *f.* Ağıllı olmaq, ağlını başına yığmaq, düzəlmək, ciddiləşmək, pis işlərdən əl çəkmək. *Yaşa dolduqca ağıllaşır.* – [Mirpaşa:] *Mahmud .. ağıllanmaq əvəzinə məktəbi buraxıb qaçıb kəndə.* Z.Xəlil. *Yəqin Həpir ağıllanıb, .. uşaqlıq xasiyyətlərini yerə qoyub, kamil adam olub.* Mir Cəlal. // Peşman olmaq (pis əməldən), düz yola düşmək, pis yoldan qayıtmaq. *Başı daşa dəydi, ağıllandı. O, hələ də ağıllanmamışdır.*

**AĞILLI** *sif.* 1. Dərrakəli, düşüncəli, şüurlu. *Ağıllı adam. – Yusifin arvadı Avropa elmlərindən dadmış bir ağıllı arvad idi.* N.Nərimanov. *Tərlan ağıllı oğlunun hər kəlməsindən xoşlanırdı.* M.Hüseyn // *məc.* Tədbirli, öz işini bilən. [Mirpaşa:] *Ağıllı ..*

*bir bağban görsə ki, .. böyük bir ağacın kiçicik bir budağı quruyub, gərək onu o saat kəssin.* Z.Xəlil.

2. Ağla əsaslanan, ağlabatan. *Ağıllı söz. Ağıllı fikir. İclasda çox ağıllı təklif irəli sürdülər. Ağıllı* (z.) *hərəkət etmək.*

3. *məc.* Tərbiyəli, qanacaqlı. *Ağıllı qız. Ağıllı uşaq.*

**AĞILLI-BAŞLI** *sif.* 1. Yaxşı, layiqli, lazımi şəkildə, qaydalı, sanballı, əməlli. [Əsgər bəy:] *Heydər bəy, bu niyyətdən düş, mənə bir on beş gün möhlət ver, mən sənə toy xərci hazır edim, ağıllı-başlı toy elə!* M.F.Axundzadə. [Hacı Həsən:] *Sənin dərdin az qalıb məni çürütsün. Xalqın da uşaqları dərs oxuyublar. Odur, hamısı ağıllı-başlı adam olublar, .. amma sən gecə-gündüz kefli.* C.Məmmədquluzadə. *Gəncdir, qoy getsin girsin darülfünuna, bəlkə orada işlər, məlumatını artırar, ağıllı-başlı bir adam olub çıxar.* Qantəmir. // Zərf mənasında. [Cahan:] *Sən bir ağıllı-başlı mənə nağıl et görüm, necə qız alarsan.* Ü.Hacıbəyov. *Rüstəm kişi Qaraşa ağıllı-başlı toy qurmaq fikrində idi.* M.İbrahimov.

2. Çoxlu, xeyli, qiymətli. [Tarverdi:] *Amma böyük sandıqdır, yəqin ki, bunun içində ağıllı-başlı mal var.* M.F.Axundzadə.

**AĞILLI-KAMALLI** *dan.* b a x **ağıllı** 1 və 3-cü mənalarda. [Erkək Tükəzban] *batinən ağıllı-kamallı bir türk qadınıdır..* B.Talıblı.

**AĞILLILIQ** *is.* 1. Düşüncəlilik, idraklılıq, zəkalılıq, şüurluluq. // *məc.* Tədbirlilik.

2. Ağıl üzərində əsaslanma, ağlabatanlıq. *Təklifin ağıllılığı.*

**AĞILSIZ** *sif.* 1. Ağıllı olmayan, düşüncəsiz, şüursuz; axmaq, gic. *Ağılsız adam.* // *məc.* Tədbirsiz, öz işini, öz xeyrini bilməyən, ehtiyatsız.

2. Ağla əsaslanmayan, ağla müğayir olan, ağla zidd olan. *Ağılsız iş. Ağılsız hərəkət. Ağılsız* (z.) *hərəkət etmək.*

**AĞILSIZLAŞMAQ** *f.* Getdikcə ağlı azalmaq; səfehləşmək, gicləşmək.

**AĞILSIZLIQ** *is.* 1. Ağıl yoxluğu, şüursuzluq, düşüncəsizlik; giclik, axmaqlıq.

2. Tədbirsizlik, öz işini, öz xeyrini bilməmə; ağılsız hərəkət, iş. *Ağılsızlıq etmək. Belə bir hərəkət ağılsızlıq olardı.*

**AĞILUMULMAZ** *sif.* Son dərəcə qəzəblənərək, özünü bilməmək dərəcəsinə gəlmiş. *Vaqif bu təşəbbüsə qarşı bir söz belə deyə bilmədi, çünki İbrahim xan qəzəblənmişdi, ağılumulmaz* (z.) *bir halda idi.* Çəmənzəminli.

**AĞILYANA** *zərf dan.* 1. Ağıl ilə, ağıl üzrə, ağıllı. // Ağlabatan, ağılkəsən.

2. Təqribən, təxminən, ehtimal üzrə.

**AĞIMSOV** b a x **ağımtıl.** *Ağımsov tüstü onun* [Cahandar ağanın] *enli dodaqlarının üstünə enmiş qalın bığlarının arasına doldu.* İ.Şıxlı.

**AĞIMTIL** *sif.* Ağ rəngə çalan, ağa çalar, azacıq ağ. *İldırım çaxdıqca hörümçək toru kimi bütün meşəni, ağacların yarpaqlarını, budaqlarını sarmış bu tor ağımtıl bir şəfəqlə parıldayırdı.* Ə.Məmmədxanlı.

**AĞIMTILLIQ** *is.* Ağ rəngə çalarlıq, açıqağlıq, ağımtıl şeyin halı.

**AĞIR** *sif.* 1. Böyük çəkisi, vəzni olan (*yüngül* ziddi). *Ağır yük. Ağır daş. Ağır çamadan. – Ağır sandıq seçmə parçalarla dolu idi.* Mir Cəlal. *Küçələr izdihamla çalxanır; Yükü ağır bir gəminin ləngəri kimi.* R.Rza. // Sanballı.

2. Güclü, şiddətli, təsirli. *Ağır yumruq. Ağır zərbə.*

3. Çox çətin, böyük zəhmət, böyük səy tələb edən; çox zəhmətli; güc, zor. *Ağır doğum. Ağır iş. Ağır məsələ. Ağır tələb. Ağır vəzifə. – Gəmi muzdurçuluğu filvaqe çox ağır sənətdir.* S.M.Qənizadə. // *məc.* Əziyyətli, məşəqqətli, əzablı, məhrumiyyətlə dolu, kədərlə dolu. *Ağır dövr. Ağır həyat. Ağır illər. – Bir səs gəlir ellərdən; Şirin-şirin dillərdən; Tanrı, balamı saxla; Ağır aylar, illərdən.* (Layla). [Yolçu:] *Biz qismətimizə düşən ağır yolu keçməsək, gələcək nəsillərimiz də o işığa tez gəlib qovuşmaz.* Ə.Məmmədxanlı.

4. *məc.* Bərk, dərin. *Ağır yuxu. – Dideyibəxtim oyanmaz, nə ağır uyğuludur.* Füzuli. *Pah atonnan, nə ağır* (z.) *yatdı bu oğlan, ölübə!* M.Ə.Sabir.

5. *məc.* Dözülməz, təhəmmül edilməz. *Ağır itki. Ağır xəbər.*

6. *məc.* Sərt, çox ciddi, şiddətli, amansız. *Ağır cəza. Ağır töhmət.* // *məc.* Çox ciddi nəticələr verə bilən, yaxud böyük cəzaya

səbəb ola bilən; çox böyük. *Ağır günah. Ağır cinayət. Ağır ittiham. Ağır məsuliyyət. – Bu dəhşət, öhdəmə düşən tarixi bir məsuliyyətin nə dərəcədə ağır* (z.) *olması fikrindən doğurdu.* M.S.Ordubadi. *Tahirin gəlib çıxdığı bu son nəticə nə qədər ağır* (z.) *olsa da, o bunu etiraf etməyə məcbur idi.* M.Hüseyn. // *məc.* Nəticəsi təhlükəli, qorxulu, çox ciddi. *Ağır yara. Ağır xəstə. Ağır xəstəlik.* – [Partizanlar] *üç nəfər ağır yaralılarını da özləri ilə sürüyərək, Kür nəhrinin .. qamışlıq sahillərinə çəkilmişdilər.* H.Nəzərli.

7. Gərgin, çətin, narahatedici, darıxdırıcı, sərbəst olmayan. *Hacı nəfəsini ağır* (z.) *alaraq tər basmış, dili ağzından bir qarış çıxmış: – Ay qardaşlar, dayanın, – deyə sürətlə gəlir.* Ə.Haqverdiyev.

8. Yavaş, sürətsiz; yavaş-yavaş hərəkət edən, ağırtərpənən. *Ağır* (z.) *tərpənmək.* – [A.Şaiq] *ağır addımlarla tribunaya qalxdı.* S.S.Axundov. *İçəri girdim. Ağır addımlarla balkona çıxdım.* M.S.Ordubadi. // Yavaş ifa edilən (çalınan). *Ağır hava. Havanı ağır* (z.) *çalmaq. – Eşitdiyimiz musiqi səslərinin bəziləri ağır və güclü* (*səqil*)*, bəziləri isə nisbətən yüngül və zəif* (*xəfif*) *olur.* Ə.Bədəlbəyli. *Aşıqlar ağır hava çalırlar. Qadın ahəstə oynayır.* Ə.Haqverdiyev.

9. *məc.* Ağırlıq təsiri bağışlayan (öz böyüklüyü, çoxluğu, sıxlığı, tutqunluğu, alçaqlığı, rənginin qəlizliyi, sürətinin yavaşlığı və s. ilə). *Ağır buludlar. Ağır boyalar* (rəssamlıqda). *Ağır akkordlar* (musiqidə). – *Gördü bir anda bir ağır dəstə; Sanki minmiş adamlar üst-üstə.* M.Ə.Sabir. *Bəzən bu səfərdə ağır dumanlar; Gəlib quldur kimi kəsir yolunu.* S.Vurğun. // *məc.* Çoxluq, böyüklük mənasında. *Dağlarda gəzən mənəm; Əhdim var, bəzənmənəm; Ağır elin qızıyam; Qürbətdə gəzəmmənəm.* (Bayatı). *Kimsə qınamasın mən təkü tənha; Necə durum ağır el qabağında.* Q.Zakir. *Çox obadan, ağır eldən keçibdi; Coşqun dərya, daşqın seldən keçibdi.* Aşıq Ələsgər.

10. *məc.* Yüngüllükdən, səlislikdən məhrum, başa düşülməsi çətin olan. *Ağır üslub. Ağır ifadə. Ağır cümlə.*

11. Qəliz, kəsafətli, pis iylənən, nəfəsi çətinləşdirən, darıxdırıcı, dözülməz. *Ağır qoxu. Ağır hava. – Kərim bəy qapını açanda ağır və boğucu, isti hava onu vurdu.* Mir Cəlal.

12. Çətin həzm edilən. *Ağır xörək.*

13. Xoşagetməz, pis, yolagetməz, qılıqsız; deyingən. *Ağır xasiyyət.*

14. *məc.* Təmkinli, vüqarlı, ciddi, heysiyyətini gözləyən. *Ağır adam. – Ağır* (z.) *otur, batman gəl.* (Məsəl). □ **Ağır olmaq** – ciddi olmaq, təmkinli olmaq.

15. Toxunan, qəlbi incidən, ürək sındıran, xatirə dəyən, xoşagetməz, acı. *Ağır söz. – Onun evində nə yeməkdən, nə geyinməkdən korluq çəkəcəkdi. Ağır söz eşitməyəcək, ağır iş görməyəcəkdi.* Mir Cəlal.

16. *məc. dan.* Hamilə, ikicanlı, boğaz.

17. Kök, yoğun, ətli-canlı. *Ağır bədən. Ağır gövdə. Ağır cəmdək.*

18. *məc.* Çox baha, bahalı, qiymətli. *Çəkidə yüngül, dəyərdə ağır. – Təbrizə Rusiyadan ticarət malı gətirilməyəcəkdir. Gətirilsə də çox ağır qiymətə duracaqdır.* M.S.Ordubadi. [Kərim bəy] *qızlarının hər ikisini gənc ikən ərə vermiş, ağır cehiz ilə köçürmüşdü.* Mir Cəlal.

19. *məc.* Cansıxıcı, faciəli, ələmli, kədərləndirici. *Ağır hiss. Ağır duyğu. Ağır fikir. Ağır mənzərə. Ağır təəssürat.*

20. *hərb.* Çox güclü təchizatı, döyüş üçün güclü vasitələri olan. *Ağır toplar. Ağır bombardman təyyarələri. Ağır tanklar. – Toplar, ağır toplar verməyir aman; Qırılmış şüşələr çarparalardan.* M.Rahim.

21. *xüs.* Bir sıra fiziki-kimyəvi, mineraloji terminlərin tərkibinə daxil olur. *Ağır metallar* (mis, qurğuşun, sink, qalay və s.). *Ağır su* (adi sudan daha çox molekulyar çəkisi olan su). *Ağır yağlar* (daş kömür qatranının emalından hasil edilən maddə). *Ağır yanacaq* (öz izafi çəkisinə görə suya yaxın olan duru yanacaq; məs.: ağ neft və s.).

◊ **Ağır eşitmək** – bir az karlığı olmaq. **Ağır əl** – 1) bərk ağrıdan, bərk zərbə vuran; 2) *məc.* şükümsüz, uğursuz. **Ağır gəlmək** – toxunmaq, könlünə dəymək, qəlbi qırılmaq. [Vaqif:] *Ancaq Məlikməmməd xanı zindana saldırmağımız Fətəliyə, görünür, ağır gəlib.* Çəmənzəminli. *Ağca qarıya ərinin bu saymazlığı elə ağır gəldi ki, o, döz-*

*məyib yerindən qalxdı.* Ə.Əbülhəsən. **Ağır oturmaq** – 1) baha oturmaq, baha başa gəlmək. *Bu paltar mənə ağır oturdu;* 2) pis nəticələnmək. *Bu söhbət ona çox ağır oturdu*; 3) özünü ciddi aparmaq. **Ağır tərpənmək** – ətalət göstərmək, gecikmək, yubanmaq, tələsməmək, vaxtı əldən vermək.

**ağır-ağır** *zərf* Yavaş-yavaş, tədriclə, asta-asta, tələsmədən. *Ağır addımlarla. Ağır-ağır yerimək. Ağır-ağır işləmək. – Qara zənci acığından nəfəs alır ağır-ağır.* S.Vurğun. *Ağ buludlar ağır-ağır hərəkət edib, cənuba doğru sürünürdü.* M.Hüseyn. *Hərdənbir tülək bulud ağır-ağır sürünüb gedir, elə bil nəhəng bir quş qırıq qanadını çəkə-çəkə ovçudan can qurtarmaq istəyir.* R.Rza.

**AĞIRAYAQ** *sif. dan.* 1. Mövhumata inananların fikrincə, guya gəlməsi uğursuzluğa səbəb olan, ayağı düşməyən. *Ağırayaq adam.*

2. Hamilə.

**AĞIRBAŞLI** *sif. dan.* Çox ciddi, ağır, təmkinli, vüqarlı. *Ağırbaşlı adam.*

**AĞIRXASİYYƏT(Lİ)** *sif.* b a x **ağır** 13 və 14-cü mənalarda. [Firidun] *..heç on beş il bundan qabaqkı dəcəl uşağa oxşamır, ağırxasiyyət və ağıllıdır.* M.İbrahimov.

**AĞIRLAMA** "Ağırlamaq"dan *f.is.*

**AĞIRLAMAQ** *f. dan.* Əzizləmək, hörmət etmək, ehtiram göstərmək, qiymətləndirmək; ucaltmaq, saymaq, qonaq eləmək. *Bir içim su ilə ağırlamadın mehmanın.* Füzuli.

**AĞIRLAŞDIRILMA** "Ağırlaşdırılmaq"dan *f.is.*

**AĞIRLAŞDIRILMAQ** "Ağırlaşdırmaq"dan *məch.*

**AĞIRLAŞDIRMA** "Ağırlaşdırmaq"dan *f.is.*

**AĞIRLAŞDIRMAQ** *f.* 1. Daha ağır etmək, vəznini, çəkisini artırmaq. *Yükü ağırlaşdırmaq.*

2. Yavaşıtmaq, sürətini azaltmaq, ləngitmək. *İşin gedişini ağırlaşdırmaq. Sürəti ağırlaşdırmaq.*

3. *məc.* Daha da çətinləşdirmək, daha da zorlaşdırmaq, mürəkkəbləşdirmək. *İşi ağırlaşdırmaq. Vəzifəni ağırlaşdırmaq.* // Oxunmasını, başa düşülməsini daha da çətinləşdirmək. *Üslubu ağırlaşdırmaq. Uzun cümlələr ifadəni daha da ağırlaşdırmışdır.* // Daha da pisləşdirmək, xarablaşdırmaq, gərginləşdirmək. *Vəziyyəti ağırlaşdırmaq.* – [Toğrul bəy] *qardaşı Davudun Arslan xatun adlı qızını Qaim Biəmrullaha verib, özü isə Qaim Biəmrullahın qızı Seyidə ilə evlənməklə başqa ölkələrlə birlikdə Azərbaycanın siyasi və ictimai vəziyyətini ağırlaşdırdı.* M.S.Ordubadi.

4. Daha da gücləndirmək, şiddətləndirmək, ciddiləşdirmək, artırmaq, daha da təsirli etmək. *Düşmənin səhvi onun tələfatını daha da ağırlaşdırdı. Cəzasını ağırlaşdırmaq. – Uca səslə ağı deyən gəlinlər Səlminazın kədərini daha da ağırlaşdırdılar.* M.Hüseyn.

5. Kəsifləşdirmək, qəlizləşdirmək, tənəffüsü çətinləşdirmək, dözülməz bir hala salmaq. *Otağın havasını ağırlaşdırmaq. Tozanaq havanı daha da ağırlaşdırdı.*

6. Həzmi çətinləşdirmək, zorlaşdırmaq. *Mədəni ağırlaşdırmaq.*

7. *məc.* Korlamaq, xarab etmək, iyləndirməyə başlamaq.

**AĞIRLAŞMA** "Ağırlaşmaq"dan *f.is.*

**AĞIRLAŞMAQ** *f.* 1. Daha ağır olmaq; yükü, çəkisi çoxalmaq. [Sadıq kişi] *soyuqda oturduqca, özünə gəldikcə vücudu ağırlaşır, kürəkləri sancır.* Mir Cəlal.

2. Daha çətin olmaq; çətinləşmək, gərginləşmək, mürəkkəbləşmək. *İşi ağırlaşmaq. Vəzifəsi ağırlaşmaq. Vəziyyəti ağırlaşmışdır. – Obalar arana köçəndən sonra Gülyazın həyatı daha da ağırlaşdı.* M.Hüseyn. // *məc.* Daha əziyyətli, daha məşəqqətli, daha əzablı olmaq, daha da pisləşmək, daha da dözülməz olmaq. *Yaşayış gündən-günə ağırlaşırdı.*

3. Pisləşmək, şiddətlənmək, bərkimək, artmaq, qorxulu bir vəziyyət almaq. *Xasayın qızdırması artır, halı get-gedə ağırlaşırdı.* Ə.Vəliyev.

4. Kəsifləşmək, dözülməz bir hala gəlmək, pisləşmək. *Otağın havası ağırlaşmışdır.*

5. *məc.* Qoxumağa, pis iy verməyə, xarab olmağa başlamaq, pozulmaq. *Ət istidən ağırlaşdı.*

6. *məc.* Tənbəlləşmək, atilləşmək; özündə bir ağırlıq hiss etmək, hərəkət edə bilməmək. *Yeyəndən sonra adam ağırlaşır.*

7. *dan.* Kökəlmək, ətlənmək, yoğunlaşmaq, tosqunlaşmaq. *Vücudu gündən-günə ağırlaşır.*

8. *məc. dan.* Hamilə olmaq, ikicanlı olmaq.

9. *məc*. Daha ciddi olmaq, təmkinli olmaq. *Yaşa dolduqca ağırlaşmaq.*

10. *məc*. Zəifləşmək, eşitmə qabiliyyəti azalmaq. *Qulağı ağırlaşmaq.*

**AĞIRLIQ** *is*. 1. Ağır şeyin halı (*yüngüllük* ziddi). *Yükün ağırlığı. Daşın ağırlığı.*

2. Ağır şey, yük. *Ağırlıq qaldırmaq. Ağırlıq qaldıran idmançı. – Qəssab bilmədi ki, bu xalqın nədən; Özü ağırlıqda qəm yükü vardır…* B.Vahabzadə.

3. "Ağır"dan *mücər. Cəzanın ağırlığı. Cinayətin ağırlığı. Həyatın ağırlığı. İtkinin ağırlığı. Vəziyyətin ağırlığı. Yaranın ağırlığı. Zərbənin ağırlığı.*

4. *məc.* Dərd, qəm, ələm, iztirab. [Nina və Mahrunun] *bir-birini qucaqlamasından o qədər xoş bir təsir aldım ki, bir anlıq bütün ağırlıqları unutdum*. M.S.Ordubadi. [Balaş:] *Gülüşcan, mən böyük ağırlıq içindəyəm, hər günüm bir cəhənnəm əzabıdır.* C.Cabbarlı. *Ürəkdə həvəs cuş edəndə gözdən axan yaşla ürəkdəki ağırlıq rəf olunur.* S.M.Qənizadə.

5. Vüqar, təmkin, ciddilik. [Südabənin] *tərpənişində bir ağırlıq, bütün vücudunda bir müvazinət gözə çarpırdı.* M.İbrahimov.

6. Ağırlıq hissi, təzyiq hissi. *Başımda bir ağırlıq hiss edirəm. – Vahid, mənə çoxdan bu can ağırlıq edirdi; Ey kaş, onu da yarə verib, yüngül olaydım*. Ə.Vahid.

7. *məc*. Qayğı, əziyyət, zəhmət. *Ağırlıq üstünə düşdü.*

◊ **Ağırlıq mərkəzi** – bir şeyin məğzi, mahiyyəti, əsli, ən əsas cəhəti. **Ağırlıq satmaq** – naz eləmək, özünü ağır göstərməyə çalışmaq, təşəxxüs satmaq. *Dindirərsən dinməz, ağırlıq satar.* M.P.Vaqif.

**AĞIRSANBALLI** b a x **ağır** 14-cü mənada.

**AĞIRSƏNGİN** *sif.* [ağır və *fars.* səngin] Ağırtəbiətli, ciddi, təmkinli.

**AĞIRSIMAQ** *məh.* b a x **ağırlaşmaq** 6-cı mənada.

**AĞIRTAXTALI** *sif. dan.* Təşəxxüslü, ağır, azdanışan, özünü ciddi göstərməyə çalışan. *Mehdiqulu ağırtaxtalı bir oğlandı, hələm-hələm canına isti keçməzdi*. Mir Cəlal.

**AĞIRTƏBİƏT(Lİ)** b a x **ağır** 14-cü mənada. *Ağırtəbiətli adam. – Nurəddin .. anasından sonra birdən-birə dəyişir, .. ağırtəbiətli bir uşaq olur.* S.S.Axundov.

**AĞIRTƏRPƏNƏN** *sif.* Ağır hərəkət edən və ya çox ağır-ağır iş görən, tələsməyən, atil. *Ağırtərpənən adam.*

**AĞIRTƏRPƏNİŞLİ** b a x **ağırtərpənən.**

**AĞIRYANA** *sif. dan.* 1. Münasib, yaraşan, ləyaqətli. *Ağıryana paltar.*

2. Ağır, ciddi. *Ağıryana adam.*

**AĞIRYÜKLÜ** *sif.* Ağır yüklənmiş, ağır yüklər daşıyan. *Ağıryüklü qatar. – Ağıryüklü fayton .. bir döngədə aşıb, oxu və çarxı sındı.* S.S.Axundov.

**AĞIR-YÜNGÜL** *is.* Ev şeyləri, müxəlləfat, şey-şüy (bəzən qiymətli şeylər, qızıl-gümüş mənasında da işlənir). *Lotular qalxıb hərə öz yorğan-döşəyini və evdə olan, ağırdan-yüngüldən nə varsa yığışdırandan sonra, İsfahan deyib, birbaş getməkdə olsunlar.* "Aşıq Qərib".

◊ **Ağır-yüngül eləmək (etmək)** – 1) yoxlamaq, ölçüb-biçmək, fikirləşmək, düşünmək, götür-qoy eləmək; 2) şeylərin ağırını qoyub, yüngülünü götürmək. *Burasını demək lazımdır ki, Hacı Tağı Veysə verdiyi otağı ağır-yüngül edib, orada o vaxtlar çox az olan bir çarpayıdan, .. bir divar güzgüsündən başqa heç nə qoymamışdı.* Ə.Əbülhəsən.

**AĞIRZƏHMLİ** *sif. dan.* Qorxunc, dəhşətli, çox acıqlı, üz-gözündən acıq tökülən, heybətli, çox zəhmli.

**AĞIZ**[1] *is.* 1. İnsan və heyvanların üzlərinin alt tərəfində, alt və üst çənələri arasında yerləşən, yeyib-içməyə və səs çıxarmağa məxsus üzv. *Ağzını yaxalamaq. Ağzı ilə nəfəs almaq. Ağzı acı dadmaq. Dişsiz ağız. Ağız boşluğu.* ☐ **Ağız suyu** – insan və heyvanın ağız boşluğunda xüsusi vəzilərin ifraz etdiyi maye.

2. Qabların və s. şeylərin açıq tərəfi. *Qazanın ağzı. –* [Piri kişi:] *Qızım, çıx ağaca və bu sallanan arıları torbanın içinə salıb ağzını büz.* S.S.Axundov. *Limon yeşiyi pəncərəyə qoyulmuşdu, hələ ağzı mıxlanmamışdı.* Mir Cəlal. // Quyunun, vulkanın və s.-nin açıq tərəfi. *Bütün fəhlələr köməkləşib, qapağı quyunun ağzına basa bildilər.* M.Hüseyn.

3. Odlu silahların lüləsinin ön tərəfindəki deşik, güllə çıxan tərəfi. *Tüfəngin ağzı. Topların ağzı düşmən istehkamına çevrildi.*

4. Kəsici alətlərin iti tərəfi; bəzi alət və ləvazimatın iş görən tərəfi. *Bıçağın ağzı. Baltanın ağzı.* – [Süleyman bəy:] *Niyə vermirəm? Buyur, ancaq gözlə* [xəncərin] *ağzı daşa dəyməsin.* Ə.Haqverdiyev. ☐ **Ağzını qaytarmaq** – kəsərin ağzını bərk bir şeyə vuraraq kütləşdirmək.

5. Bir yerin giriləcək və ya keçiləcək tərəfi: girəcək, qapı. *..İtlər hürə-hürə mağaranın ağzını aldılar, ancaq cürət edib içəri girə bilmədilər.* S.S.Axundov. *Bu zaman bir quş alaçığın ağzından ildırım kimi şığıyıb yükün altına soxuldu.* A.Şaiq. *Bu anda kabinetin qapısı ağzında Tahirlə Cəmil göründü.* M.Hüseyn. // Bir yerin və ya şeyin bilavasitə qabağı, önü, yaxınlığı. *Öküz arabası qapımızın ağzında durur, arabaçı Salman kişi də şeyləri üsulluca arabaya yerləşdirirdi.* A.Şaiq. *Qapı ağzında cavan və əyri bitmiş bir söyüd ağacı var idi.* Mir Cəlal.

6. Bir şeyin bilavasitə kənarı, yanı, qırağı. *Yolun ağzı.*

7. Çayın dənizə tökülən yeri.

8. Qabaq, yaxınlıq, ərəfə mənasında (çox vaxt ismə qoşularaq, yiyəlik birləşməsi şəklində işlənir). [Hacı Qara:] *Bəs sövdə eləməyəcəksiniz? Bayram ağzıdır, yalavaşlıq istəməzsinizmi?* M.F.Axundzadə. [Qurban:] *Bayram ağzı yenə göndərəcəyəm, özüm də yazın axır ayında gələcəyəm.* A.Şaiq. *Yazağzı əkilən göyərtilər də baxımsızlıqdan qurumuşdu.* S.Rəhimov.

9. Saylarla – dəfə, yol. *Papirosunu yandırıb bir ağız sorandan sonra başını yuxarı qaldırdı.* Mir Cəlal. // Yenə saylarla oxumaq haqqında. *Mənzərə çox xoşuma gəldi. Bir gün iki ağız şikəstə oxudum.* H.Sarabski.

◊ **Ağız açmaq** – 1) müraciət etmək, xahiş etmək (bir iş üçün); yalvarmaq. [Məşədi Məmməd] *yaxşı bilirdi ki, Səməd əbəs yerə bir adama ağız açmaz.* B.Talıblı. [Mina xala] *düz üç gün hər yeri gəzmiş, qonum-qonşuya ağız açmış, hətta şəhərə gedənlərə yalvarmışdı..* İ.Şıxlı; 2) ölüyə ağlamaq, ölünü oxşayıb ağlamaq, ağı demək. **Ağız bir eləmək** – sözü bir etmək, sözləşmək. **Ağız burmaq** – 1) narazılıq izhar etmək, küsmək; 2) imtina etmək. **Ağız büzmək** – b a x **ağzını büz(üşdür)mək.** [İmran] *bir-iki dəfə arxasınca ağız büzüb gileylənənlər olduğunu da görmüşdü.* İ.Şıxlı. **Ağız deyəni qulaq eşitməmək** – çox səs-küy, qarışıqlıq haqqında. *Hərənin boş başından boş və axmaq bir mühakimə çıxardı. Ağız deyəni qulaq eşitməzdi.* H.Sarabski. **Ağız sözü** – etibarsız, inanılmayan, ağızdan eşidilən xəbər, söz. *Bəzi əskidən əski olan əqrəbasından; İstəməyir eşitsin hər ağız sözü, məncə.* M.Müşfiq. **Ağız-ağıza vermək** – 1) bir yerdə oxumaq, bağırışmaq. *Meşənin tamam bülbülləri tarların səsinə cəm olmuşdu. Tar çalındıqca onlar da ağız-ağıza verib oxuşurdular.* Ə.Haqverdiyev. *Bazarda bəzzazın tərəkəməyə min and ilə şey satmağı, hambalların birçəkləmə davası, baqqalların ağız-ağıza verib qatığa müştəri axtarmaqları – heç biri onun* [Səmədin] *zahir və batinində səbəbi-təğyir ola bilmirdi.* Çəmənzəminli. *Qurbağalar ağız-ağıza verib vaqqıldaşırdı.* Mir Cəlal; 2) baş qoşmaq, mübahisə etmək (bu mənada bəzən "ağız-ağıza verib danışmaq" şəklində işlənir). [Mirzə Turab:] *..Mən belə mollalarla ağız-ağıza verib danışmaq istəməyirəm.* B.Talıblı. *Məcid Tarverdi ilə ağız-ağıza vermək istəməyib məsələni udub ötüşdürdü.* S.Rəhimov. **Ağızdan bilmək** – əzbər bilmək. **Ağızdan boş** – 1) sözünün kəsəri, qüvvəti olmayan, sözü keçməyən, zabitəsiz; 2) söz saxlamayan, sirr saxlaya bilməyən. **Ağızdan çıxmaq** – deyilmək, söylənilmək. *Ağızdan çıxmamış cavabı məlum; Ölçülü-biçili sualınız yox...* M.Araz. **Ağızdan diri (iti)** – dilavər, dilli, dilli-dilavər. **Ağızdan gələni (çıxanı) demək** – söymək, söyüb biabır etmək. **Ağızdan olmaq** – çox danışmaqdan, deməkdən yorulmaq, ağzı yorulmaq. **Ağızdan-ağıza keçmək (söylənmək, deyilmək, dolaşmaq)** – yayılmaq, bir-birinə keçmək. *Bu qisim ağızdan-ağıza söylənən .. ədəbiyyat hər bir* [xalqın] *hal və şəninə və övzai-məişətinə müxtəs olub, onun dünya üzrə nə növ yaşamasına şəhadət verir.* F.Köçərli. *Nadir Bakıya varid olduqda alay komissarı təyin olunmuşdu və həmin bu xəbər*

*də ağızdan-ağıza keçib .. gəlib kəndə çatmışdı.* B.Talıblı. *Qəmərin gözəlliyi ağızdan-ağıza dolaşdı, sorğu-suallar başlandı.* Çəmənzəminli. **Ağızlara düşmək** – dillərə düşmək, dillərdə sözü söylənmək (mənfi mənada). **Başqasının ağzı ilə oturub-durmaq** – öz fikri olmamaq, başqasının sözü ilə hərəkət etmək. **Ağzı açılmaq** – 1) danlamağa başlamaq; // söyməyə başlamaq; 2) kütləvi halda gəlməyə, axışıb gəlməyə, yeriməyə başlamaq. *Sürünün ağzı açıldı. Qoşunun ağzı açıldı. – Get-gedə qaçqınların ağzı açılmağa başladı, camaat əkini buraxıb, canlarını qurtarmaq üçün dağ yuxarı qaçırdı.* Çəmənzəminli. *Zəvvarların ağzı açıldı: qoyun qurbanı gətirən kim, pul gətirən kim, yağlı çörək gətirən, qoğal gətirən, fəsəli gətirən, pirə halva nəzir deyən və başqa nəzir gətirən kim...* Ə.Haqverdiyev. **Ağzı aparmaq** – ağzına gələni danışmaq, hədd-hüdudunu aşmaq, danışığını bilməmək, nalayiq danışmaq. **Ağzı ayrıla (açıla) qalmaq** – heyrətdə qalmaq, çox təəccüb etmək. *Ceyran pis vəziyyətdə idi. Onun yanşaq ağzı açıla qalmışdı.* Mir Cəlal. *Belə bir dəfn mərasimini görən adamların ağızları açıla qalmışdı.* P.Makulu. **Ağzı bir yerə yığmaq** – razılaşdırmaq, birləşdirmək, həmrəy etmək. [Cahan:] *..Gərək kənd arvadlarının ağızlarını bir yerə yığasınız.* Ə.Haqverdiyev. **Ağzı deyil!** – bacarmaz, cürət edə bilməz, hünəri deyil. [Teymur ağa:] *Onun ağzı deyil mənim mirzəmi qovdura.* M.F.Axundzadə. **Ağzı dəymək** – tovlamaq, aldatmaq, dilə tutmaq. [Ağamərdan:] *Bəli, indi məlum oldu ki, o, haramzadənin, o bidinin ağzı sizə dəyibdir.* M.F.Axundzadə. **Ağzı günə buraxmaq** – başlı-başına buraxmaq. *Daha mirzə yazıq nə qayıracaq idi? O qaça bilməz, dəftərxananı ağzı günə buraxıb bir yana gedə bilməz.* S.Rəhimov. **Ağzı günə qalmaq** – yiyəsiz qalmaq, sahibsiz qalmaq, başlı-başına qalmaq, boş qalmaq, istifadəsiz qalmaq. **Ağzı ilə quş tutmaq** – çox cəld, çox zirək, hər şeyi çox tez başa düşən adam haqqında deyilir. **Ağzı köpüklənmək** *məc.* – hiddətlənmək, coşmaq, qəzəblənmək, hirslənmək. *Şişman adam coşdu, daşdı, ağzı köpüklənərək: – Bu sözün sənə neçəyə mal olacağını bilmirsən, – dedi.* A.Şaiq. *Hikmət İsfahani o qədər acıqlanmışdı ki, daha nə dediyini, nə danışdığını bilmirdi, ağzı köpüklənir, dodaqları titrəyirdi.* M.İbrahimov. **Ağzı nədi(r)** – "nə ixtiyarı var, nə cürətlə" mənasında işlənən təhdid ifadəsidir. [Kosaoğlu:] *Uşağın ağzı nədir atasını sevməsin, ə! Mənim yanımda cınqırlarını çəkmirlər!* İ.Şıxlı. **Ağzı soyumaq** – ölmək. **Ağzı sulanmaq** – tamaha düşmək, həsrətində olduğu şeyi görüb tamahsılanmaq. *Başqası pul sanayanda onun ağzı sulanır; Başlayır hürməyə, nəfsi, təməi qurcalanır.* M.Ə.Sabir. **Ağzı süd qoxumaq** – b a x **ağzından süd iyi gəlmək**. *Ağzın süd qoxuyur, körpəsən hələ; Mən xalqın dərdini bilən şairəm.* S.Rüstəm. **Ağzı sürüşmək** – çaşmaq, səhv etmək. **Ağzı yanmaq** – təşəbbüsü pis nəticələnmək, xeyir görməmək, zərər çəkmək, peşman olmaq. **Ağzına ağız (dil) vermək** – sözünü qüvvətləndirmək, təhrik etmək, coşdurmaq. *A kişi, buna baş qoşma, ağzına ağız verib özündən çıxartma.* S.Rəhimov. **Ağzına almaq** – 1) söyləməyi layiq bilmək, demək, danışmaq. [Nuruoğlu:] *Belə sözləri ağzına alıb danışma.* M.Hüseyn; 2) qavramaq, əhatə etmək, qaplamaq. *Alov hər yeri ağzına almışdı. Gecə elə işıq idi ki, iynə saplamaq olardı.* Çəmənzəminli. **Ağzına baxmaq** – öz fikri olmayıb başqasının iradəsinə tabe olmaq. **Ağzına çullu dovşan yerləşmir (sığmır)** – həddindən artıq lovğa, təşəxxüslü, özünü öyən, gopçu adam haqqında. **Ağzına gələni demək** – bərk danlamaq, töhmətləndirmək, biabır etmək, söyüb danlamaq, söymək. *Molla bacı .. həyətə çıxdı və üzünü qonşuya tutub ağzına gələni dedi.* Çəmənzəminli. **Ağzına götürmək** – qışqırmaq, bağırmaq mənasında. *Salmanovanın səsi dəhlizi ağzına götürdü.* Ə.Əbülhəsən. **Ağzına qurd düşmək** – heç kəs tərəfindən dindirilməmək, danışdırılmamaq, sayılmamaq. **Ağzına su almaq (götürmək)** – susmaq, dinməmək, danışmamaq, susub durmaq, söhbətdə, danışıqda iştirak etməmək, sükut etmək. *Qoy desin, a Mürsəl kişi, niyə ağzına su alıb dillənmirsən?* M.Hüseyn. *Qaranlıq çökəndə uca çinar ağacları dilə gələr, küçələr isə ağzına su*

*alardı.* Mir Cəlal. **Ağzında dili yox** – məzlum, həlim, yazıq, aciz adam haqqında. **Ağzından çıxmaq** – istəmədən, qeyri-ixtiyari bir söz demək, söyləmək. **Ağzından düşməmək** – daim təkrar etmək, dilindən düşməmək, dilinin əzbəri olmaq. [Kərim baba] *nəşəsin pozmaz, tütək çalar, sümsü qayırar, hələ mahnısı ağzından heç düşməzdi.* A.Şaiq. **Ağzından qaçırmaq** – istəmədən və özü bilmədən demək, söyləmək, açmaq. **Ağzından qan qoxusu (iyi) gəlir** – xata törətmək istəyən, dava axtaran, xatakar adam haqqında. **Ağzından süd iyi gəlmək** – çox gənc və təcrübəsiz adam haqqında. [Ağabəyim:] *Eh, qızım, – dedi, – bilmirəm səni necə başa salım, .. sənin ağzından hələ süd iyi gəlir.* Çəmənzəminli. **Ağzından vurmaq** – qabaqcadan rədd etmək, qaytarmaq, sözünü ağzında kəsmək, danışmağa qoymamaq, ruhdan salmaq. **Ağzını açdırmaq** – söylətmək, deyinməsinə, ləyaqətsiz, pis sözlər söyləməsinə səbəb olmaq (adətən pis adam haqqında). [Kor kişi:] *Axmağın qızı, axmaq, .. ağzımı açdırma.* S.Hüseyn. **Ağzını açıb gözünü yummaq** – ağzına gələni danışmaq. **Ağzını açmaq** – danışmağa başlamaq. *Sonra oğlu ağzını açıb atasının məzəmmətinin qabağında söylədi..* Ə.Haqverdiyev. [Həpir:] *Xalqın yeddi arxa yadları ağzını açanda tərif tökür; mənim doğma atam ayağımdan çəkir.* Mir Cəlal. **Ağzını Allah yoluna açmaq** – 1) dilənmək, dilənçilik etmək; 2) ağzına gələni danışmaq. **Ağzını ara(la)maq** – birisinin ürəyini, fikrini, rəyini, sirrini, məqsədini bilməyə təşəbbüs etmək. *Sərdar Rəşid bununla mənim ağzımı aramaq istəyirdi..* M.S.Ordubadi. **Ağzını bağlamaq** – susdurmaq, danışmağa qoymamaq. [Qənbərqulu:] *Ağa, başına dönüm, bu necə ola bilər? Birdən-birə elin ağzını bağlamaq olmaz ki..* B.Talıblı. **Ağzını bədə açmaq** – pis danışmaq, pis niyyətlə danışmaq, yaxşılığa danışmamaq. **Ağzını büz(üşdür)mək** *məc.* – narazılıq ifadə etmək, bəyənməmək, məmnuniyyətsizliyini üzünün ifadəsi ilə anlatmaq. **Ağzını dağıtmaq** – artıq-əskik danışmaq, ağzına gələni danışmaq, danışığını bilməmək. **Ağzını əymək** – 1) təqlidini çıxarmaq, yamsılamaq. *Kosanın qılçaları bir-birinə dolaşa-dolaşa dönüb çıxdı. Sübhanverdizadə onun arxasınca ağzını əyə-əyə söyləndi.* S.Rəhimov; 2) b a x **ağzını büz(üşdür)mək. Ağzını əzmək** – döymək. **Ağzını göyə açmaq** – veyillənmək, avara-avara gəzmək, heç bir işlə məşğul olmamaq. **Ağzını xeyrə açmaq** – yaxşı söz danışmaq, xeyirli söz danışmaq, uğur diləmək. **Ağzını ovmaq** – döymək, cəzalandırmaq. **Ağzını qaytarmaq** *məc.* – lazımi cavab vermək, rədd və qəti etiraz etmək. *Səmayə bu çıxışı ilə Möhlətovun ağzını elə qaytardı ki, daha sədrin deməyə sözü qalmadı.* Mir Cəlal. **Ağzını saxlamaq** – danışmamaq, cavab verməmək, söz qaytarmamaq, pis söz söyləməkdən çəkinmək. **Ağzını sulandırmaq** – b a x **ağzının suyunu axıtmaq.** *"Toxam" – desə də, bu iy onun* [Əlyarovun] *iştahasını qıdıqlayır, yavaş-yavaş ağzını sulandırırdı.* M.Hüseyn. **Ağzını sürümək** – müəyyən fikir söyləməkdən çəkinmək. **Ağzını təmiz saxlamaq** – pis söz söyləməkdən çəkinmək, danışarkən ehtiyatlı olmaq, ədəbli danışmaq, tərbiyəli olmaq. **Ağzını tutmaq** – sükuta, dinməməyə məcbur etmək, danışmağa qoymamaq, susdurmaq. [Safo:] *Selin qabağını almaq çətin olduğu kimi, elin ağzını da tutmaq mümkün deyildir.* S.Rəhimov. **Ağzını yoxlamaq** – b a x **ağzını ara(la)maq.** [Əhməd:] *Sabah özün elçi get, qızın anasının ağzını yoxla, gör nə deyirlər.* A.Şaiq. **Ağzını yormaq** – faydasız və boş yerə söylənib durmaq. **Ağzını yummaq** – qorxutmaqla, hədələməklə, yaxud pul verməklə və ya başqa bir vasitə ilə susdurmaq, sükuta, danışmamağa məcbur etmək. **Ağzının sözünü bilmək** – danışarkən pis sözlər işlətməkdən çəkinmək, danışığını bilmək. [Xanpərvər bəyim:] *İtil buradan, vələdüzina! Sən heç ağzının sözünü bilmirsən!* N.Vəzirov. **Ağzının suyunu axıtmaq** – tamaha salmaq, bərk tamahsılandırmaq, həsrətdə qoymaq. *Qönçənin gözəlliyi həm bəyin, həm də bəy balalarının ağızlarının suyunu axıdırdı.* S.Rəhimov. [Salatın ürəyində:] *Qoy ağzının suyu axsın, qoy qardaşımın dalınca sürünsün, boyuna qurban olduğumun boyuna vurulsun, – deyə xəya-*

*lından keçirdi.* İ.Şıxlı. **Bir ağızdan** – hamı birlikdə, hamı bir yerdə, hamı birdən, xorla. *Bir ağızdan oxumaq. – Atabəy qəsrinin ətrafına yığılan minlərcə Toğrul tərəfdarları bir ağızdan "Yaşasın mələkə!" – deyə qışqırırdılar.* M.S.Ordubadi. **Canı ağzına gəlmək** – b a x **can**. **Gözlərini ağzına dikmək** – b a x **göz. Sözü ağzında qalmaq** – fikrini deyib qurtarmağa macal tapmamaq, sözü yarımçıq qalmaq. *Onlara* [Səriyyə və uşaqlarına] *fikir verən yox idi. Sözləri ağızlarında qalırdı.* M.İbrahimov. **Sözü ağzından tökülmək** – səhih, aydın danışa bilməmək, sözü çeynəyə-çeynəyə danışmaq.

**ağız-ağız** b a x **ağızbaağız** 2-ci mənada. *Şöhrətini ağız-ağız, oymaq-oymaq eşitdik biz.* S.Vurğun.

**AĞIZ**[2] b a x **ağuz.**

**AĞIZAALINMAZ** *sif.* Çox biədəb, ədəbsiz, nalayiq. *Ağızaalınmaz söz.*

**AĞIZABAXAN** *sif. dan.* Öz fikri olmayıb, başqalarının sözü ilə hərəkət edən.

**AĞIZBAAĞIZ** *zərf* 1. Tamam, lap dolu, ləbələb, ağzına qədər. *Qab ağızbaağız doludur. Qazanı ağızbaağız doldurmaq. Teatrın zalı ağızbaağız camaatla doludur. – Gecə isə çənlər ağızbaağız neftlə dolardı.* H.Sarabski.

2. Ağızdan-ağıza, bir ağızdan o birisinə keçərək. *Xəbər ağızbaağız dolandı.*

**AĞIZ-BURUN** *is. dan.* Surət, sifət. // Zahiri görünüş, görkəm. [Pası:] *Ucqardakı ağzıburnu hisli kaha kimindir?* S.Rəhimov.

◊ **Ağız-burun bəhəm eləmək** – təşəxxüslənmək, özünü çəkmək, həddini aşmaq, başa çıxmaq, qudurmaq. [Salamov:] *..Sən* [Ağamov] *indi belə ağız-burun bəhəm eləmisən ki, .. mənim quyularımı hasara alırsan?* C.Cabbarlı. [Cahil:] *Adə! Belə ağız-burun bəhəm eləmisən ki, mənim sözümün qabağına söz deyirsən?* H.Sarabski. **Ağız-burun əymək** – narazı olduğunu bildirmək, küsmək, deyinmək. **Ağzı-burnu düşmüş** – yararsız, sınıq, yaraşıqsız, eybəcər.

**AĞIZ-BURUNLU** *sif. dan.* Görkəmli, zahiri görkəmi yaxşı, abırlı.

**AĞIZCIQ** *is.* 1. "Ağız"dan *kiç.*

2. *bot.* Çiçəyin dişiciyinin üst tərəfdən ayrılmış hissəsi. [Miçurin] *axtalanmış çiçəyin qalpağını açıb onun dişiciklərinin ağızcıqlarına tozcuqları səpdi və yenə də qalpağı bağladı.* M.Axundov.

**AĞIZDAN** *zərf* 1. Şifahi olaraq, yazı ilə deyil, dil ilə, dilcavabı. *Ağızdan söyləmək.*

2. Əzbər, əzbərdən. *Şeri ağızdan bilmək.*

**AĞIZDANDOLMA** *sif. köhn.* Keçmişdə lüləsi ağzından doldurulan tüfəng və s. *Ağızdandolma tüfəng. – Adamın diqqətini, hər şeydən əvvəl, həyətin baş tərəfindəki ağızdandolma yoğun lüləli bir top cəlb edirdi.* P.Makulu.

**AĞIZDOLUSU** *zərf* 1. Özünün doğru, haqlı olduğuna inanaraq, təşəxxüslə, lovğalovğa. *Ağızdolusu demək.* – [Qurban Mərəndinin] *Marağanın meyvə bağlarından, quru əriyinin məziyyətlərindən ağızdolusu danışaraq, üç ildə bir dəfə də oraya gedə bilmədiyini söylədikdə, Firidun təəccüblənmişdi.* M.İbrahimov.

2. Cəsarətlə, həvəslə, fəxrlə. *Cənubi Azərbaycan yazıçılarının çox sağlam və qüvvətli bir kollektivi vardır.. Biz onların yaradıcılığından ağızdolusu danışmalıyıq.* M.Rahim.

**AĞIZLAMAQ** *f. dan.* 1. Ağzı ilə qoparmaq, ağzı ilə dartmaq, ağzını toxundurmaq.

2. *məc.* Töhmətləndirmək, acıqlanmaq, üstünə qışqırmaq; nəsihət vermək.

**AĞIZLAŞMA** "Ağızlaşmaq"dan *f.is.*

**AĞIZLAŞMAQ** *qarş.* 1. Bir-biri ilə sözləşmək, söz-sözə gəlmək; dillə dalaşmaq, söyüşmək. *Qoca .. Dağbaşevlə ağızlaşdığını və heç kəsi vecinə almadığını bir daha nəzərindən keçirirdi.* S.Rəhimov. *Mən ömrümdə söyüşməmişəm. Birisi ilə ağızlaşmamışam.* Mir Cəlal.

2. Dilləşmək, məsləhətləşmək, sözü bir yerə qoymaq.

**AĞIZLI** *sif.* 1. Ağzı olan (b a x **ağız**[1] 2-ci mənada). *Ağızlı şüşə. Ağızlı qab.*

2. Kəsici tərəfi olan (alət və s. haqqında). *Bir odlu vulkandan yadigarmıdır; O xəncər ağızlı daş çalpaları?* S.Vurğun.

3. *məc. dan.* Dilli, dilavər, dilli-dilavər, yaxşı danışmaq qabiliyyəti olan. // *məc. dan.* Qoçaq, diribaş, sözükeçən. *Ağızlı adam. – Hacı Kazım məhəllədə ağızlı və sözüötən adam idi.* H.Sarabski.

**AĞIZLIQ** *is.* 1. Duru şeyləri bir qabdan başqa ağzı dar qaba tökmək üçün yuxarısı enli, aşağısı dar cihaz; qıf.

2. Qab və s.-nin ağzına qoyulan qapaq, tıxac və s.

3. Atın və başqa heyvanların ağzına vurulan saman torbası. // Qapan itlərin, yaxud başqa heyvanların üzünə keçirilən tor və s. [Balaqların] *başına çubuqdan, yaxud paslanmayan metaldan səbət kimi toxunmuş ağızlıq keçirmək lazımdır.* Ağabəyli.

4. At yüyəninin ağıza keçirilən dəmir hissəsi.

5. Telefon dəstəyinin ağıza tutulan tərəfi.

6. Nəfəslə çalınan musiqi alətinin ağıza salınan hissəsi. // Müştük.

7. B a x **ağızotu.**

**AĞIZOTLUQ** *is. köhn.* Çaxmaqlı tüfəngin və ağızdan doldurulan topun ağızotu tökülən yeri.

**AĞIZOTU** *is. köhn.* Keçmişdə çaxmaqlı tüfəngi və ağızdan doldurulan topu atmaq üçün onların ağızotluğuna tökülən barıt.

**AĞIZSIZ** *sif.* 1. Ağzı olmayan (b a x **ağız**[1] 2 və 5-ci mənalarda).

2. Küt, kəsərsiz (silah və s.).

3. *məc. dan.* Dilsiz-ağızsız, sözü keçməyən, sözü kəsərsiz; aciz, məzlum, fağır, cəsarətsiz. *O, çox ağızsız adamdır. Adam bu qədər ağızsız olmaz.*

**AĞIZSIZLIQ** *is. dan.* Ağzında kəsər olmama, sözü keçməmə, dilsizlik; acizlik məzlumluq, fağırlıq, cəsarətsizlik.

**AĞIZSÜRÜTMƏSİ** b a x **ağızucu.** *Tütünçüoğlu bu haqda danışmağa könlü yoxmuş kimi ağızsürütməsi dedi..* M.S.Ordubadi. *Həmzə ağızsürütməsi bir neçə şey dedi.* Ə.Əbülhəsən.

**AĞIZUCU** *zərf* Könülsüz, etinasız, başdansovma. *Kişi bir az fikirləşdi, sonra ağızucu cavab verdi.* S.Rəhimov. *Xanpəri qardaşı oğlunun suallarına ağızucu cavab verib onu başdan eləməyə çalışdı.* Ə.Vəliyev.

**AĞKİRPİK** *is. bot.* Xalq arasında heyvanlar üçün dərman kimi işlədilən bir ot.

**AĞKÖYNƏK(Lİ)** *is.* Köhnə məişətdə: aşura günü əyninə ağ köynək geyərək, baş yaran mövhumatçı. *..Qurban kəsmək, imam təziyəsi və qışqırıqlı və cəlallı məhərrəm təziyəsi və ağköynək büsatı olardı.* C.Məmmədquluzadə. *Ağköynəklər zikrdən təkrar coşdular, parlaq qılınclar və xəncərlər göydə oynadı, hönkürtü meydanı və şaxtalı havanı dəhşətlə titrətdi.* Çəmənzəminli.

**AĞQANADLI** *sif.* Qanadları ağ olan. *Məktəb damına qonub bu ağqanadlı quşlar; Güldü ağızdolusu qəhrəmanlarla birgə.* S.Rüstəm.

**AĞQIZIL** b a x **platin**.

**AĞQOYUNLULAR** *cəm, tar.* XV əsrdə Cənubi Azərbaycanda və ona qonşu olan bəzi ölkələrdə hakimiyyət sürmüş oğuz-türkmən qəbilələrindən biri.

**AĞQVARDİYAÇI** *is. tar.* Ağ qvardiya (b a x **qvardiya**) sıralarında olub, sovet hökuməti əleyhinə mübarizə etmiş adam. [Dəmirov:] *Görünür ki, haranın ağqvardiyaçısı isə gəlib, burada gizlənibdir.* S.Rəhimov. // Sif. mənasında. *Ağqvardiyaçı zabit.*

**AĞLABATAN** *sif.* Ağıl qəbul edə bilən, inanıla bilən, mümkün ola bilən; məqsədəuyğun. *Ağlabatan söz. Ağlabatan təklif.* – [Hikmət İsfahani:] *..Sənin sözün ağlabatan sözdür.* M.İbrahimov. *Gəldiyev ağlabatan söz danışırdı.* Mir Cəlal.

**AĞLABATMAZ** *sif.* Ağıl qəbul etməyən, ağla sığmayan, məntiqə uymayan, məntiqsiz.

**AĞLABATMAZLIQ** *is.* Ağıl qəbul etməmə, ağla sığmamazlıq, inanıla bilməməzlik, məntiqə uymamazlıq, məntiqsizlik.

**AĞLADICI** *sif.* 1. Ağladan, gözyaşardıcı. *Ağladıcı qaz. Ağladıcı bomba.*

2. Təsirli, yanıqlı, acınacaqlı, təəssüflü. *Ağladıcı səs. Ağladıcı sözlər. Ağladıcı hadisə. Ağladıcı vəziyyət.*

**AĞLAGƏLMƏZ** *sif.* İmkansız, təsəvvür edilməsi mümkün olmayan, həqiqətə uyğun olmayan; fövqəladə; çox böyük, çox güclü. *Ağlagəlməz hadisə. Ağlagəlməz hiylə. Ağlagəlməz fikir.* – [İmran:] *İnsanın həyatında çox qəribə, ağlagəlməz hallar olur.* İ.Şıxlı.

**AĞLAĞAN** *sif.* və *is.* 1. Çox ağlayan, həmişə ağlayan, tez-tez ağlayan. *Ağlağan uşaq. – Çoxlarının bezdiyi və uzaq qaçdığı .. ağlağan uşaqları Nazimə sanki əfsun ilə ələ alır, sakit edir*(*di*).. Mir Cəlal.

2. *məc.* Həmişə halından şikayət və narazılıq edən, həmişə öz həqiqi vəziyyətini pis göstərməyə, varını gizlətməyə çalışan.

[Qəhrəman:] *Olmaya mən heç belə ağlağan olmamışam.* S.Rəhimov.

**AĞLAĞANLIQ** *is.* 1. Tez-tez, daim ağlamaq xasiyyəti.

2. *məc.* Həmişə halından şikayət və narazılıq etmək xasiyyəti, həmişə öz həqiqi vəziyyətini pis göstərməyə çalışmaq xasiyyəti.

**AĞLAMA** 1. "Ağlamaq"dan *f.is.*

2. *məc.* Fəryad. *Nəriltisi, ağlaması onun bənzər tufana; Göz yaşının qətrələri sıçrar o yan-bu yana.* A.Səhhət.

**AĞLAMAQ** *f.* 1 Şiddətli ağrı, ruhi sarsıntı və ya başqa bir ağır təəssürat nəticəsində göz yaşı axıtmaq. *Sevincdən ağlamaq. Sancıdan ağlamaq. Uşaq ağlayır. – Gözüm yaşı qəmimdən ağlamaqdan döndü dəryaya; Məni axır həlak eylər bu çeşmi-xunfəşan sənsiz.* S.Ə.Şirvani. *Firidun onun* [Şəmsiyyənin] *ağladığını və ya güldüyünü təyin edə bilmirdi.* M.İbrahimov. *Ağca ağlaya-ağlaya* (z.) *onun* [ərinin] *dalınca gələrək, yuxusunu nağıl edib dedi..* Ə.Əbülhəsən. ◻ **Acı-acı ağlamaq** – yanıqlı-yanıqlı ağlamaq.

2. *məc.* Yas tutmaq, matəm saxlamaq. [Mirzə Fətəli:] *Ağlayın el üçün, ağlayın millət üçün, qoyun gözləriniz kor olsun!* Ə.Haqverdiyev.

3. *məc.* Həyatından, yaşayışından, vəziyyətindən şikayətlənmək.

4. *məc.* Yalvarmaq, yalvara-yalvara istəmək. ◻ **Ağlayıb-sızlamaq (sıtqamaq)** – ağlayıb yalvarmaq, yalvarıb-yaxarmaq, ürəkdən ağlayıb yalvarmaq.

5. Bir sıra sözlərə qoşularaq müxtəlif ifadələr düzəldilir; məs.: gününə ağlamaq, qan ağlamaq.

**AĞLAMALI** *sif.* Pis, faciəli, çox ağır, acınacaqlı. [Cahan:] *A balam, ağlamalı günlər keçdi, indi isə sevinməli, xoşlanmalı günlərimiz gəlibdir.* Ə.Haqverdiyev.

**AĞLAMSI(N)MA** "Ağlamsı(n)maq"dan *f.is.*

**AĞLAMSI(N)MAQ** *f.* Ağlayan kimi olmaq, gözləri yaşla dolmaq, doluxsunmaq. *Kiçikbəyim ağlamsınaraq başmağı onun* [Məmməd bəyin] *əlindən alıb, hasarın üstündə oturdu.* Çəmənzəminli. // Yalandan ağlamaq, özünü ağlayan kimi göstərmək. *Mən Mahrunun gözlərinə diqqətlə baxırdım, onun gözləri ağlamsıyırmış kimi idi.* M.S.Ordubadi. *Səlimnaz arvad ağlamsınan bir tərzdə köksünü ötürdü.* M.Hüseyn.

**AĞLAR** *sif.* Ağlayan, gözüyaşlı, gözü yaşla dolu. *Kişi ağlar gözilə qıldı fəğan; Söylədi oğlu: – Ağlama, babacan!* M.Ə.Sabir. *Seyid ağlar gözü ilə başladı: – Mən Kirmanşahda ikən gecə röyada cəddimi gördüm.* Ə.Haqverdiyev. *Ağlar gözümdə qanə dönər əşki-həsrətim.* H.Cavid. // *məc.* Qüssəli, ələmli, kədərli, fəlakətli, müsibətli.

◊ **Ağlar günə düşmək** – b a x **ağlar (günə) qalmaq. Ağlar (günə) qalmaq** – yiyəsiz qalmaq, xaraba qalmaq, bədbəxt olmaq, müsibətə düşmək. **Ağlar (günə) qoymaq** – bədbəxt etmək, dərdə salmaq, müsibətə salmaq. *Nə sövdadır yenə düşüb başına; Oğul, gedib, ağlar qoyma sən bizi.* "Aşıq Qərib".

**AĞLARCASINA** *zərf* Özünü ağlayan kimi göstərərək, ağlamsına-ağlamsına.

**AĞLASIĞ(IŞ)AN** *sif.* B a x **ağlabatan.** [Heydər bəy:] *Ağlasığışan iş deyil.* S.S.Axundov. *Hikmət İsfahaniyə məhbəsdə rast gəlmək ağlasığan şey deyildisə də, həqiqət idi.* M.İbrahimov.

**AĞLASIĞMAZ** b a x **ağlabatmaz.** *İranı doldurmuş və arasıkəsilmədən axıb gəlməkdə olan alman casusları, İranın hakim dairələri və mürtəce təbəqələr Hitlerin qalib gələcəyini sadə bir həqiqət kimi irəli sürür, öz təbliğatlarında .. ağlasığmaz uydurmalara qədər hər şeydən istifadə edirdilər.* M.İbrahimov.

**AĞLASIĞMAZLIQ** b a x **ağlabatmazlıq.**

**AĞLAŞMA** 1. "Ağlaşmaq"dan *f.is.*

2. *is.* Yas, matəm. [Əbdürrəhman bəy:] *Arvad, bilirsən nə var; mən sənə çox məsləhət görürəm durub gedəsən bir ağlaşmaya.* N.Vəzirov. *Köhnə məzarlıqda bir ağlaşma var; Qazılır ortada bir dərin məzar.* M.Müşfiq. ◻ **Ağlaşma açmaq (qurmaq)** – bir yerdə yığılıb ağlamaq. [Arvadlar] *ağlaşma qurub ərlərinin ətəklərindən yapışıb davaya getməyə qoymurlar.* S.S.Axundov.

**AĞLAŞMAQ** *qarş.* Birlikdə ağlamaq, ağız-ağıza verib ağlamaq, bir-birinə qoşulub ağlamaq. *Bir kənddə camaat ağlaşa-ağlaşa* (z.) *yüzbaşının ayağına yıxılıb: – "Bəs toxumluğu aparırsınız, biz başıdaşlı*

*nə əkək?" deyirdi.* Çəmənzəminli. *Anabala baş-başa verib ağlaşdılar*. B.Talıblı. *Az keçmədən, xarabalıq insan səsi ilə doldu. Uşaqların ağlaşmağı kəndin kimsəsiz sükutunu pozdu.* Ə.Məmmədxanlı. // Ölünün üstündə ağı deyib bir yerdə ağlamaq.

**AĞLATMA** "Ağlatmaq"dan *f.is.*

**AĞLATMAQ** *f.* 1. Ağlamağa məcbur etmək, birinin ağlamasına səbəb olmaq. *Uşağı ağlatmaq*. – [Laçın] *iki-üç yaş özündən böyük oğlanları təklikdə döyüb ağlatmağı da bacarırdı.* M.Hüseyn.

2. *məc*. Çox təsir etmək, son dərəcə mütəəssir etmək. *Ağlatmayır insanları; Leyli-Məcnun dastanları.* S.Vurğun.

**AĞLAYAN** *f.sif.* b a x **ağlağan.** *Ağabala çox ağlayan uşaq idi. Ağlayanda da üzünü elə turşudardı ki, elə bil mərsiyə deyəcəkdi.* Çəmənzəminli.

**AĞLAYICI** *sif.* Ağlayan.

**AĞLAYIŞ** *is.* Ağlama. *Kişilərdə yersiz gülüşlər nə qədər çoxsa, qadın və qızlarda da yersiz ağlayış və qısqanışlar da həddindən artıqdır.* M.S.Ordubadi. *Bu ağlayış və inilti səslərindən çəkilən sədlər onları* [yolçuları] *saxlamağa qadir deyildir*. Ə.Məmmədxanlı.

**AĞLI: ağlı-bozlu, ağlı-qaralı** və s. – hər rəngli, bütün rənglərdə olan. *Köç yolu ilə gedən ağlı-bozlu sürülərin sayı-hesabı yox idi.* Ə.Vəliyev. *Dizlərini yerə qoyub irtməklərini oynada-oynada, analarının döşünü dümsükləyə-dümsükləyə əmişən quzular ağlı-qaralı qumaşlar kimi göy otun üstünə səpələnmişdilər.* R.Rza. [Dəmirov] *göy üzündə dolanan ağlı-qaralı buludlara baxdı.* S.Rəhimov.

**AĞLIKƏSMƏZ** *sif.* Hələ ağlı bir şey kəsməyən. *Ağlıkəsməz uşaq.*

**AĞLIQ** *is*. Ağ şeyin halı, bir şeyin ağ rəngi. *Qarın ağlığı. Dərinin ağlığı. – Əvvəl gözəllərdə gərəkdir çağlıq; Ondan sonra ola sadəlik, ağlıq.* M.P.Vaqif.

◊ **Üz ağlığı** – düzlük, doğruluq, təmizlik, namus.

**AĞMALA** *is. məh.* 1. Divara çəkilən birinci mala (suvaq).

2. Çəltik şumunda sürülən ilk mala.

**AĞMATAN** *sif. dan.* Dərisi ağ, kök və göyçək (qız).

**AĞMAYA** *sif. dan.* Ağ və kök (uşaq və ya qadın). *Məcid kişi köynəyinin ətəyilə alnının tərini silə-silə dedi: – Bunun bir ağmaya vaxtı vardı ki... Dünya gözəli idi Minnət.* İ.Məlikzadə.

**AĞNAĞAZ** *is. məh.* Ehtiyacı ödəmək üçün üyüdülən azacıq dən.

◊ **Ağnağaz üyütmək** *məc.* – boş yerə danışmaq, boşboğazlıq etmək. *Deyəsən, məsələmiz qurtarıbdır. İndi də keçmişik ağnağaz üyütməyə.* Ə.Vəliyev.

**AĞNAQ** *is. məh.* 1. Heyvanın ağnadığı yer.

2. Dağlarda torpağı sürüşmüş və ya su yuyub aparmış yer.

3. Bir yerə yığılıb iylənən palçıqlı su, lehməli gölməçə, çuxur, oyuq.

**AĞNAMA** "Ağnamaq"dan *f.is.*

**AĞNAMAQ** *f.* 1. Dalı üstə uzanıb ayaqlarını yuxarı qaldıraraq, o üz-bu üzə çevrilmək (bəzi heyvanlar haqqında). *Eşşək ağnayır.* // *məc. dan.* Yerə sərilərək üst-başını toza-torpağa sürtüb batırmaq. *Uşaqlar tozun içində ağnayırlar*. – *Günah çamırında ağnayana bax; Onun da baxtına günəş doğulur.* M.Araz. *Comalaşıb qarışqatək qaynardıq; Yavaş-yavaş bağçalarda ağnardıq…* Şəhriyar.

2. *məh.* Uçmaq, yıxılmaq, dağılmaq, tökülmək. *Birinin divarının kərpicləri ağnayıb tökülmüşdü biz durduğumuz yerə tərəf.* C.Məmmədquluzadə. *Elə bil Qədim dayının üstünə bir dağ ağnayıb töküldü.* S.Rəhimov.

**AĞNAŞMA** "Ağnaşmaq"dan *f.is.*

**AĞNAŞMAQ** *qarş*. Bir yerdə ağnamaq, birgə ağnamaq.

**AĞNATMAQ** *f.* Aşağı sürmək, endirmək. *Qayadan sürüsün ağnadır çoban; Qoyunlar, quzular mələr yanbayan.* M.S.Ordubadi.

**AĞNAVAZ** *sif.* Ağarmış, solğun. *..Bu işıqdan Lidyanın ağnavaz çöhrəsi daha da solğun görünürdü.* Ə.Əbülhəsən.

**AĞRI** *is.* 1. Duyğu sinirlərinin qıcıqlanması nəticəsində bədənin hər hansı bir yerində hiss edilən əziyyət, əzab; sancı, sızı; acı. *Diş ağrısı. Baş ağrısı. – Birdən Sabir doğruldu, bədənində şiddətli bir ağrı hiss edərək üz-gözünü turşutdu.* M.Hüseyn. *Məsum kişinin .. başına bərk bir ağrı sıçradı, qaşları düyüldü..* Mir Cəlal.

2. *məc*. Kədər, qəm, qüssə, dərd, ələm, iztirab hissi. *Səni balam kimi bağrıma basdım; Sənin hər ağrına mən qulaq asdım*. S.Vurğun.

3. *məc.* İnciklik, narazılıq.

◊ **Ağrı çəkmək** – hamilə qadınlarda: doğmağa yaxın bərk sancı və əziyyət çəkmək. *Torpağa ona görə "ana torpaq" deyirlər ki, o da ana kimi hamilə olur, ağrı çəkir, doğur, o da ana məhəbbətlidir, ana səxavətlidir, övladcanlıdır.* İ.Məlikzadə. // Məc. mənada. *Gecə boylu bir qadındır... ağrı çəkərək; Xoşüzlü bir uşaq kimi doğur səhəri.* S.Vurğun. *Xərabəlik anası ağrı çəkib, şər doğur; Xeyir oyanmır hələ, bu da bir inqilabdır.* Şəhriyar. **Ağrı tutmaq** – 1) ağrı başlamaq; 2) hamilə qadınlarda və ya heyvanlarda: doğmağa yaxın bərk ağrı və sancı başlamaq. **Ağrım ürəyinə** – qarğış və nifrin bildirən ifadə. [Bədircahan:] *Ağrım xanın ürəyinə, xan gələndə dünya qopmayacaqdır ki..* N.Vəzirov. **Ağrın mənə gəlsin** – b a x **ağrın(ı) alım (ağrın ürəyimə). Ağrın(ı) alım (ağrın ürəyimə)** – birinə mehribançılıqla xitab, müraciət və ya oxşayıb əzizləmə zamanı işlənən ifadədir. *Ağrın alım, mənim bağrım çatdadı; Arzum bu dağdaşı qatıb qatdadı..* Şəhriyar. [Qızyetər:] *Sizciyəz sağ olun, ay ağrın alım; Bircə Xanlarımdır dövlətim, malım.* S.Vurğun.

**AĞRI-ACI** *is.* 1. Çox işləmək, yol getmək və s. nəticəsində bədəndə duyulan ağrı və ya yorğunluq hissi. *Bədənimizin ağrıacısı çıxdı. – Taxtabənddə adam nə rahat yatırmış. Adam yuxudan ayılanda da heç yerində ağrı-acı duymurmuş.* Ə.Əbülhəsən.

2. Xəstəlik, naxoşluq.

**AĞRI-ACISIZ** *zərf* Əziyyətsiz, əzabsız, asanlıqla. *Nina İraida məsələsinin ağrı-acısız həll olunduğu üçün əlimi sıxıb təşəkkür etdi.* M.S.Ordubadi.

**AĞRIKƏSƏN, AĞRIKƏSİCİ** *sif. tib*. Sakitləşdirən, ağrını azaldan. *Ağrıkəsən dərmanlar.*

**AĞRILI** *sif.* Ağrısı və acısı olan, ağrıyan.

**AĞRIMA** "Ağrımaq"dan *f.is.*

**AĞRIMAQ** *f.* 1. Bədənin bir yerində ağrı hiss etmək. *Dişi ağrımaq.* – [Gülüş:] *Sevil, nə üçün belə solğunsan, yoxsa bir yerin ağrıyır?* C.Cabbarlı.

2. *dan.* Kefsizləmək, naxoşlamaq. *Neçə gündür ki, ağrıyıram.*

3. *məc.* Kədərlənmək, ürəyi sınmaq, incimək.

◊ **Ağrımaz başı(m)** – sakitlik, qayğısızlıq; cəncəl işə qarışmama, özünə aid olmayan bir işə qarışmamaq mənasında. *Azacıq aşım, ağrımaz başım.* (Məsəl). [Molla Qasım:] *Bu fikirdən daşının, ağrımaz başınızı bəlaya salmayın.* S.S.Axundov.

**AĞRISIZ** *sif.* və *zərf* 1. Ağrımayan, ağrısı olmayan, incitməyən; əziyyətsiz. *Ağrısız əməliyyat. Dişi ağrısız çəkmək.*

2. *məc*. Zərərə və ya ağır nəticələrə səbəb olmayan.

**AĞRISIZLAŞDIRICI** *sif. tib.* Ağrıya qarşı hissizləşdirici. *Ağrısızlaşdırıcı dərmanlar.*

**AĞRISIZLAŞDIRILMAQ** *məch. tib.* Ağrıya qarşı hissizləşdirilmək, keyləşdirilmək.

**AĞRISIZLAŞDIRILMIŞ** *f.sif. tib.* Ağrıya qarşı hissizləşdirilmiş, keyləşdirilmiş.

**AĞRISIZLAŞDIRMA** "Ağrısızlaşdırmaq"dan *f.is.*

**AĞRISIZLAŞDIRMAQ** *f. tib.* Ağrıya qarşı hissizləşdirmək. *Doğumu ağrısızlaşdırmaq.*

**AĞRISIZLIQ** *is*. 1. Ağrıya qarşı hissizlik, ağrı olmaması.

2. *məc*. Əziyyətsizlik, zərərsizlik, asanlıq, zəhmətsizlik.

**AĞRITMA** "Ağrıtmaq"dan *f.is.*

**AĞRITMAQ** *f.* 1. Əziyyət vermək, ağrı vermək, incitmək, ağrıya səbəb olmaq. *Yara bərk ağrıdır. Çiban ağrıdır. – Çarpanaq yaralarının yeri .. ağrıtmırdı.* Ə.Əbülhəsən.

2. *məc*. Könlünü sındırmaq, ürəyini incitmək, toxunmaq. *Bu duyğu Nərimanın ürəyini ağrıtdı.* Mir Cəlal.

**AĞRIYAN** *f.sif.* Əziyyət verən, incidən, narahat edən. *Ağrıyan dişi çəkdirmək.*

**AĞSAÇ(LI)** *sif.* Saçı ağarmış; qoca. *Ağsaçlı qoca.*

**AĞSAQQAL** *sif.* və *is.* 1. Saqqalı ağarmış, qoca. [Bayraməli:] *Belə tərbiyət sahibləridirlər ki, ağsaqqal ataları gəlir otağa, .. heç biri yerindən tərpənmək istəmir.* N.Vəzirov. *Baqqal dükanı qarşısında toplanıb söhbət edən ağsaqqallar, məhəllə cavanları bir para sözlər danışırdılar.* H.Nəzərli. // Ümumiyyətlə, qoca, yaşlı.

*"Molla Nəsrəddin" tək bir nəfər müəllifin əsəri deyil, "Molla Nəsrəddin" mənim bir neçə əziz yoldaşlarımın məcmuəsidir ki, mən də onların ancaq ağsaqqal yoldaşıyam.* C.Məmmədquluzadə. *İndi bu qürbət şəhərdə ağsaqqal vaxtımda bir tikə çörəyin dalınca düşüb gəzirəm*. Çəmənzəminli.

2. *məc*. Bir ailənin, elin, cəmiyyətin ən yaxşı və hörmətli adamı, başçısı. *İkinci məclis vaqe olur Danabaş kəndinin ağsaqqal və mötəbəri Hacı Namazalının həyatində.* C.Məmmədquluzadə. *Camaat bir neçə nəfər ağsaqqal intixab edib, məsləhət üçün haman bəyin yanına göndərdilər*. Ə.Haqverdiyev. *Qabaqda kəndin ağsaqqalları, qadın və qızları, dallarınca gənclər, uşaqlar qarşımıza çıxdılar*. S.Rüstəm.

◊ **Ağsaqqallar şurası (məclisi)** – müxtəlif təşkilatlarda bəzi orqanların adı (məs.: nümayəndə rəhbərlərinin, fraksiya başçılarının şurası və s.).

**AĞSAQQALLIQ** *is*. 1. Qocalıq.

2. *məc. dan.* Başçılıq, böyüklük, rəhbərlik. *Bir qədərdən isə o* [Aslan], *uşaqların rəğbətini qazanmaqla onların ağsaqqallığını öz əlinə götürə bildi*. S.Rəhimov. ☐ **Ağsaqqallıq etmək** – 1) başçılıq etmək, böyüklük etmək, rəhbərlik etmək, idarə etmək; *Nurcabbar düz deyir, Dədə palıd bundan sonra hələ min il ömür sürəcək, bu meşəyə böyüklük, ağsaqqallıq eləyəcək.* İ.Məlikzadə; 2) nəsihət etmək, öyüd vermək, yol göstərmək.

**AĞSİFƏT** *sif.* Sifətinin rəngi ağ olan.

**AĞSOL** *is. məh.* Kiçik çay balığı növlərindən birinin adı.

**AĞSU** *is*. 1. Dağ və hündür təpələrdən axıb gələn qar və yağış suları.

2. *dan.* Yüngül su, mədəyə xeyirli su.

**AĞŞIN** b a x **ağbəniz.**

**AĞTİKAN** *is. bot.* Dəvələrə yem olan tikanlı ot.

**AĞTİKANLIQ** *is*. Ağtikan bitən yer, ağtikan çox olan yer.

**AĞTORPAQ(LI)** *sif.* Torpağı kirəcli, tərkibində kirəc olan. *Ağtorpaq yer*.

**AĞTÜK(LÜ)** *sif.* Tükləri ağ olan. *Ağtük*(*lü*) *it. Ağtük*(*lü*) *toyuq*. *– Ağtüklü Həştərxan pişiyi üsulluca qapını açıb kandarda dayanır.* H.Sarabski.

**AĞU** b a x **ağı**[1]. *Hicrin şərabı acıdır, müştaqə içirmə anı; Neçün ki, yar ol ağuyi içirməz, ey can, yarına.* Nəsimi. *Mən deməm ki, içmədim mey sənsiz, ey namehriban; İçdim, amma ləblərindən ayrı, bir ağu kimi.* S.Ə.Şirvani.

**AĞULAMA** "Ağulamaq"dan *f.is.*

**AĞULAMAQ** b a x **ağılamaq.**

**AĞULANMA** "Ağulanmaq"dan *f.is.*

**AĞULANMAQ** b a x **ağılanmaq.** *Ver şəfa ləbindən, yazığam mənə; Zəhri-fərağınla ağulanmışam.* Q.Zakir.

**AĞULU** b a x **ağılı**. *Bağrımın qanın ki gördün, ağulu aşımdır ol.* Xətayi. *Təlx göftarsız olmaz ləbi-yar, ey aşiq; Çox həvəs eyləmə ol şərbətə kim ağuludur*. Füzuli.

**AĞUŞ** *is*. [*fars.*] Qucaq. [Tapdıq:] *Bəs eylə isə gəl ağuşuma, qucaqlaşalım.* C.Cabbarlı. *Biz onun* [vətənin] *ağuşunda göz açmışıq, – o bizim hamımızın əziz anamızdır.* Ə.Məmmədxanlı. // Məc. mənada. *Madərləriniz etdi sizə mehrü məhəbbət; Ağuşi-şəfəqqətdə sizi bəslədi rahət.* M.Ə.Sabir. ☐ **Ağuşuna almaq** – 1) qucaqlamaq; 2) *məc.* qaplamaq, əhatə etmək. *Silah səslərinin gurultusu, patıltısı, pulemyot atəşinin şaqqıltısı kəndi öz ağuşuna alıb əridirdi*. M.Hüseyn. **Ağuşuna çəkmək** – b a x **ağuşuna almaq** 1-ci mənada. *Hər gül öz yarını çəkib ağuşə; ..Yatma, yatma, ayıl, sən də gəl huşə.* Nəbati. *Ağuşə çəkib arizi-ziybanı şəbü ruz; Aləmdə o zülfün kimi bir bəxtəvər olmaz.* S.Ə.Şirvani. *Sakit dəniz dalğalanıb o vaxtda gəldi cuşə; Qucaqlayıb məhəbbətlə çəkdi onu ağuşə*. A.Səhhət.

**AĞUZ** *is.* Sağmal heyvanlar doğduqda məmələrindən çıxan ilk süd. [Səba] *camışı oxşaya-oxşaya sərnic dolusu ağuz sağdı.* S.Rəhimov.

**AĞÜRƏK** b a x **ağciyər**.

**AĞÜZLÜ** *sif.* Üzünün dərisi ağ olan. *Olya hündürboylu, uzunsaçlı, ağüzlü, xumargözlü və dolu bədənli bir qız idi.* İ.Musabəyov.

**AĞVALİDEYN** [*ər.*] *köhn*. Ata-ana üzünə durma, qabarma; ata-ananın itaətindən çıxma. *Biz övrətə heç bir söz dəmərik, halbuki ağvalideyn, yəni ata və ananın üzünə durmaq böyük günahlardan hesab olunur.* "Mol. Nəsr.".

**AĞYAĞIZ** *sif.* Üzü ağ, ağbəniz, ağsifət. *Ağyağız uşaq. Ağyağız oğlan*.

**AĞYAL** *sif.* 1. Ağ yallı, ağ yalı olan. *Ağyal at.*

2. *məc. dan.* Ağsaç, ağbirçək. *Ağyal mamaça .. üzərlik və qara şəvəni səkinin divarlarından asırdı.* S.Rəhimov.

**AĞYANIZ** b a x **ağyağız.**

**AĞYARPAQ** *is. bot.* Dəniz sahili qumlarında bitən çoxillik ot bitkisi.

**AĞYARPAQLI** *sif. bot.* Yarpaqlarının rəngi ağ olan.

**AĞYOL** *is. astr.* Aydınlıq gecələrdə göy qübbəsində işıq zolağı kimi görünən ulduzlar yığını; Südyolu, Kəhkəşan.

**AĞYONCA** *is. bot.* Çoxillik paxlalara aid yem bitkisi.

**AĞZIAÇIQ** *sif.* Maymaq, huşsuz, diqqətsiz. ☐ **Ağzıaçıq qalmaq** – heyrət içində qalmaq, təəccüb etmək. *..Müəllim Əsədi qarşısına alıb yola düşdü və uşaqlar da ağzıaçıq qalıb, onlarla bərabər gedə bilməmələrinə təəssüf etdilər.* B.Talıblı.

**AĞZIAÇIQLIQ** *is.* Maymaqlıq, huşsuzluq, diqqətsizlik.

**AĞZIBİR**[1] *zərf dan.* Sözübir, dilbir, müttəfiq.

**AĞZIBİR**[2] *is. dan.* Tək bir çıxacağı olan yer, darısqal yer, möhkəm yer, çıxılmaz yer. // Dam, həbsxana. *Saldın axır öz əlinlə özünü ağzıbirə; Vec bitirməz sənə, dönmə dəxi daşa, dəmirə.* M.Ə.Sabir. [İskəndər:] *Doğru deyir, ağa, onlar heç vaxt özlərini bu ağzıbirə salmazlar.* N.Vəzirov. *Axırda özü kələyə düşdü. Tutub saldılar ağzıbirə.* M.Hüseyn.

**AĞZIBİRLİK** *is. dan.* Söz birliyi, ittifaq, sözü bir olma.

**AĞZIBOŞ** *sif.* 1. Söz saxlaya bilməyən, sirr saxlaya bilməyən; sözünün üstündə durmayan, etibarsız, dəyanətsiz. // Zabitəsiz, zəif iradəli, qeyri-ciddi, sözü keçməyən. *Ağzıboş adam.*

2. Naqqal, boşboğaz.

**AĞZIBOŞLUQ** *is.* 1. Sözünün üstündə durmama, etibarsızlıq. // Zabitəsizlik, ciddiyyətsizlik, zəiflik, sözü keçməməzlik.

2. Naqqallıq, boşboğazlıq.

**AĞZIBÜTÖV, AĞZIBÜTÜN** *sif.* Ciddi, sözünün üstündə duran, dayanıqlı, sirr saxlayan. *Min, kefin istədiyi səmtə çap, bir az ağzıbütün ol, çünki burada iş var.* S.Rəhimov.

**AĞZIBÜTÖVLÜK, AĞZIBÜTÜNLÜK** *is.* Ciddilik, zabitəlilik, sözünün üstündə durma, sözü keçmə; sirr saxlama.

**AĞZICIRIQ** *sif. dan.* 1. Ağzının bir tərəfi cırıq olan.

2. B a x **ağzıboş** 1-ci mənada.

**AĞZIDAĞINIQ** *is.* və *sif. dan.* Söz saxlamayan, sirr saxlamayan; xəbərçi. [Heydər bəy:] *A kişi, bilmirəm hansı ağzıdağınıq naçalnikə məni nişan veribdir.* M.F.Axundzadə.

**AĞZIDAĞINIQLIQ** *is. dan.* Ağzıdağınıq adamın xasiyyəti.

**AĞZIDUALI** *sif. köhn.* Daima dua oxumaqla, ibadətlə məşğul olan adam; dindar, mömin. *Nitqi həqiqətli, sözü fal kişi; Ağzıdualı qoca baqqal kişi.* M.Ə.Sabir. [Münəvvər] *həmişə dəstəmazlı, ağzıdualı* (z.)*, pak niyyətlə getsə də, nəticə vermirdi.* Mir Cəlal. [Xeyransa:] *A kişi, mən oğlanı görməmişəm, anası canlara dəyən bir adamdır. Məclislər yaraşığı, əlitəsbehli, ağzıdualı mömin atası var.* H.Sarabski.

**AĞZIƏYRİ** *sif.* 1. Ağzının quruluşu əyri olan.

2. *məc.* İncik, küskün, narazı.

**AĞZIGEN** *sif.* Ağzı enli, enli ağızlı. *Ağzıgen şüşə.*

**AĞZIGÖYÇƏK, AĞZIGÖVÇƏK** *is. dan.* Ağzına gələni danışan adam, məsuliyyətsiz danışan adam; boşboğaz. [Məmməd:] *Bir nəfər ağzıgöyçək gedib onlara xəbər aparsa ki, Məmməd meyxanada idi, onda mən yaxamı onların əlindən qurtara bilmərəm.* M.S.Ordubadi. *Kənardan baxan ağzıgöyçəklər Qüdrətin ailə münasibətindəki zahiri soyuqluğu onların* [Qüdrət və Lalənin] *bir-birini sevmədiyində görürdülər.* M.Hüseyn.

**AĞZIGÖYÇƏKLİ, AĞZIGÖVÇƏKLİK** *is. dan.* Boşboğazlıq, ağzıboşluq, ağzına gələni danışma. [Gövhərtacın anası:] *Sənin haqqında arvadlar iki min söz danışıb ağzıgöyçəklik eləyəcəklər.* Ə.Haqverdiyev.

**AĞZIHEYVƏRƏ** b a x **ağzıpərtöv.**

**AĞZIHƏDƏLİ** b a x **ağzıyelli.**

**AĞZIKƏSƏRLİ** *sif. dan.* Sözüötən, sözükeçən, nüfuzlu; sözündə möhkəm.

**AĞZIKÖPÜKLÜ** *sif. dan.* Qudurğan, azğın. *Dağlarda qar əriyəndə və yaz yağışları başlayanda bu dayaz çay ağzıköpüklü bir əjdahaya dönürdü.* Çəmənzəminli. *..Dağətəyi*

*kəndi .. ağzıköpüklü ağalarına qarşı baş qaldırmamış deyildi.* S.Rəhimov.

**AĞZIQARA** *is.* və *sif.* Xalq arasında itə və xüsusilə canavara verilən ad. *Ağzıqara canavar düşmənidir çobanın; Yanındakı boz köpək yoldaşıdır çobanın.* A.Şaiq. *Bir ağzıqara şiddətlə hürərək, sıçrayıb irəli yüyürdü.* B.Talıblı.

**AĞZIQƏŞƏNG** b a x **ağzıgöyçək.** *..Bir para ağzıqəşənglər başlayıblar qəzetlərində yazmağa ki, gərək övrətlər oxusunlar, tərbiyə tapsınlar, .. cəmiyyət tərtib eləsinlər.* C.Məmmədquluzadə.

**AĞZIMVAY** *sif. dan.* Aciz, ölüvay, cəsarətsiz, key.

**AĞZIMVAYLIQ** *is. dan.* Acizlik, ölüvaylıq, cəsarətsizlik, keylik.

**AĞZIODLU** *sif. dan.* Çox hirsli, acıqlı, tünd danışan. *Ağzıodlu* (z.) *danışmaq.*

**AĞZIPƏRTÖV** b a x **ağzıyava**.

**AĞZIPƏRTÖVLÜK** b a x **ağzıyavalıq.**

**AĞZIPOLAD(LI)** b a x **ağzıkəsərli.**

**AĞZIPOZUQ** b a x **ağzıyava.**

**AĞZIPÜSTƏ** *sif.* Ağzı çox kiçik və zərif.

**AĞZISÖYÜŞLÜ** b a x **ağzıyava.** *..Bu müstəbid təbiətli adam eyni zamanda bir küçə qalmaqalçısı qədər ağzısöyüşlü, tərbiyəsiz .. idi.* M.İbrahimov.

**AĞZIYARI** *sif.* Ağzına qədər dolmamış, yarımçıq.

**AĞZIYARIQ** *sif.* Dodağının bir yeri yarıq olan.

**AĞZIYASTI** *is. məh.* Hər iki tərəfi yastı olan külüng növü.

**AĞZIYAVA** *sif. dan.* Söyüşkən, hərzə danışan, ədəbsiz danışan, ağzına gələni danışan.

**AĞZIYAVALIQ** *is. dan.* Söyüşkənlik, ədəbsiz danışmaq xasiyyəti, ağzıpərtövlük. *Axı bu ağzıyavalığın sənə nə faydası var ki, öz həmməzhəblərini xarici ölkələrdə bəla və qaxınc oxuna hədəf edirsən..* M.F.Axundzadə.

**AĞZIYELLİ** *sif. dan.* Yekə-yekə danışan; hərbə-zorba ilə, hədə-qorxu ilə danışan. *Ağzıyelli adam. – Polis, jandarm və ağzıyelli mürtəcelərin zülmü xeyli azalmış, müxtəlif hizblər, ittihadiyyələr meydana çıxmışdı.* M.İbrahimov.

**AĞZIYIRTIQ** *sif. dan.* Sirr saxlamayan, söz saxlamayan; boşboğaz, çərən-pərən danışan.

**AĞZIYIRTIQLIQ** *is.* Sirr saxlamamaq xasiyyəti; boşboğazlıq.

**AĞZIYUXARI** *zərf* Yuxarıya doğru, yuxarı tərəfə istiqamət alaraq; üzüyuxarı, başıyuxarı. [Fətəli xan] *o döşdən tutmuş bu Şuşa dərələrini qoşunu ilə doldurmuşdu, .. ağzıyuxarı qalaya tərəf daraşmışdılar.* Çəmənzəminli.

**AH** 1. *nida.* Ağrı, həyəcan, həsrət və s. hissləri ifadə edir. *Ah, başım ağrıyır. – Ah, zalım! Ah, kim, oldum yolunda can fəda.* M.Ə.Sabir. *Bir zaman, ah ki, bir tair idim azadə; Əcəba, kim məni saldı bu xərababadə?* M.Hadi. [Səfər bəy:] *Ah! Yaman yorulmuşam, səhər sübhdən gəzirəm, heç bir zad tapa bilmədim.* B.Talıblı. // *İs. mənasında.* Fəryad, fəğan. *Rəsulam, ahıma dağlar dayanmaz; Dərdim çoxdur mənim kimsələr bilməz.* "Aşıq Qərib". *Bu ahdan sonra deyəsən onun* [Məsum kişinin] *sinəsi şumlanmış zəmi kimi boşaldı.* Mir Cəlal. // Təəssüf, kədər, peşmanlıq, ümidsizlik, məyusluq ifadə edir. *Ah, bilsəydim, heç gəlməzdim! Ah, onu bir daha görməyəcəyəm!* – [Bahadır:] *Ah, insanı bir-birindən ayıran "Uçurum dərələr!". Mən sizi məhv etmək istərkən, siz məni məhv etdiniz.* N.Nərimanov. [Sədəf:] *Ah, bu beş il, indi o günlər mənə bir yuxu kimi gəlir.* İ.Əfəndiyev. // *Təəccüb, heyrət, sevinc, həmçinin gözlənilməz bir şey qarşısında doğan hissləri ifadə edir. Ah, nə gözəl mənzərədir! Ah, nə yaxşı gəldin!* □ **Ah çəkmək** – kədər, qüssə, təəssüf, həsrət, heyrət, həyəcan ifadəsi olaraq "ah" demək. *Ala gözlüm, səndən ayrı düşəli; Ah çəkməkdən bağrım qana dönübdür.* Aşıq Ələsgər. *Qoca tarzən Cavadın arvadı müztərib halda tez-tez qapını açıb, küçəyə baxırdı və ah çəkərək otağa qayıdırdı.* Ə.Haqverdiyev. *Sona xala .. dərdini mənə söylədi. Axırda bir ah çəkərək dedi: – Kaş oğlum Bəşir sağ olaydı, bu azadə qadınları görəydi.* S.S.Axundov. **Ah etmək (eləmək)** – həsrət çəkmək, təəssüflənmək, qəmlənmək, ah çəkmək. *Əğyar əlindən ah edərəm hər nəfəs, vəli; Cövri həmişə aşiqi-miskinə yar edər.* Nəsimi. *Ah eylədigim sərvi xuramanın üçündür.* Füzuli. *Ah eylədigim nəşəyi-qəlyanın üçündür.* M.Ə.Sabir.

2. *is.* Fəryad, fəğan. *Çərxə çıxardı ahımı, canımı yandırdı qəmin.* Nəsimi. *Dağıdır hər*

*ləhzə rəxti-eyşimi ahim yeli.* Füzuli. *Əflakə kəmənd atdım sənsiz; Hər ah ki, çəkdim aşiqanə.* Heyran xanım. *Yandırır atəşi-ahilə gülü gülzarı; Çəkməyin Seyyidi, yar olmasa, gülzarə tərəf.* S.Ə.Şirvani. ◻ **Ahı göyə (göylərə) çıxmaq (ucalmaq)** – fəryad etmək, son dərəcə kədərlənmək, qüssələnmək, qəmlənmək, inləmək. *Gah göstərdi qədin, göylərə çıxdı ahım; Gah göstərdi gözün, eylədi bimar məni.* S.Ə.Şirvani. *Möhnət çəmənindən gül dərə-dərə; Ucalır şairin ahı göylərə.* S.Vurğun.

3. *is. köhn.* Bəddua, qarğış. *Atanın duası əsər eylər, ananın ahı.* (Ata. sözü).

**AHA** *nida.* 1. Bir şeyi birdən-birə başa düşdükdə, bir şeyi axtararkən gözlənilmədən ona rast gəldikdə, yaxud da unudulan bir şey birdən yada düşdükdə deyilir. *Aha, yadıma düşdü! Aha, yaxşı əlimə düşmüsən! Aha, sən də gəlmisən ki? Aha, o da buradadır!* – [Qaraş:] *..Qorxuram, çata bilməyələr.. Aha, qoçaq Novruz, deyəsən, özünü yetirəcək. ..Deyəsən tutacaq.* C.Məmmədquluzadə. *Həmin medallı hamballardan birisi Məşədi Əsgəri görcək "Aha! Maşadi, cəhənnəm ol buradan" – deyə hayqırdı.* S.M.Qənizadə. [Lalə:] *Aha, .. demək, sizin belə də işiniz varmış!* İ.Əfəndiyev.

2. Təsdiq, razılıq bildirir: əlbəttə, yaxşı, hə, bəli, doğru. *Aha, aha, elə lazımdır.*

**AHAL** b a x **ahıl.**

**AHALLAŞMA** "Ahallaşmaq"dan *f.is.*

**AHALLAŞMAQ** b a x **ahıllaşmaq.**

**AH-AMAN** b a x **aman** 6-cı mənada. *Öz qəti hökmünü verəcək zaman; Dünya görməyəcək bir də ah-aman!* Ə.Cəmil.

**AH-ƏFĞAN, AHÜ ƏFĞAN** *is.* [*fars.*] b a x **ah-nalə, ahü nalə.** *Ahü əfğanı bülbüllər; Dili-şeydadan öyrənmiş.* Q.Zakir.

**AHƏN** *is.* [*fars.*] *klas.* Dəmir. *Peykanlarınla doldu tənim, afərin sənə; Bidad çəkməyə tənimi ahən eylədin.* Füzuli. *O qədər ki, peykan vurub cismimə; İtibdir bədənim ahən içində.* Q.Zakir.

**AHƏNG** *is.* [*fars.*] 1. Səslər, rənglər və s. arasında uyğunluq, müvafiqət. *Ahəngi pozmaq. Səslərin xoş ahəngi. Boyalarda ahəng yoxdur.* – *Səslərin ahəngi cırcıramanın oxumasına elə bənzəyirdi ki, sanki, doğrudan da, cırcırama o sözləri deyirdi.* S.S.Axundov. // Məc. mənada. *Sabunçudan şəhərə gələn qatar küçənin ahəngini birdən-birə dəyişdirdi.* M.S.Ordubadi. *..Hər şey əbədi və pozulmaz bir ahənglə qəlbini oxşayır, hər şey füsunkar bir gözəlliklə ona* [Firiduna] *baxıb gülümsəyirdi.* M.İbrahimov.

2. *məc.* Gözəl səs, avaz. *Bu səs Jenyanın qulağında başqa bir ahənglə cingildədi.* M.S.Ordubadi. [Mirzə Valeh] *bülbüllərin min bir nəğməsini dinləyir, .. axırda bir neçə beyt söyləyir, bu ahəngə qoşulurdu.* S.Rəhimov. // Ton. *Balacayev acıqlı bir ahəng ilə: – Bəs bu gün haranız ağrıyır? – deyə soruşdu.* S.Rəhimov. *Gəldiyev həmişə səsinə, hərəkətinə sirli bir ahəng verməyi sevərdi.* Mir Cəlal.

3. Nəğmə, mahnı, hava. *Səhər bülbüllər əfğanı deyil bihudə gülşəndə; Füzuli, naleyi-dilsuzinə ahəng tutmuşlar.* Füzuli. *Oxu şiddətlə bir ahəngi-hicaz; Ucadan başla, oxu bir avaz.* S.Ə.Şirvani. *Bizi ahənglərin şad eylər; Qəlbi yatmışları irşad eylər.* A.Səhhət.

◊ **Ahəng qanunu** *dilç.* – əsasən türk dillərində: sözlərdə, həmçinin kök və şəkilçilərdə qalın saitlərin qalınları, incələrin incələri izləyib, bir-birinə uyğunlaşması hadisəsi.

**AHƏNGDAR** *sif.* [*fars.*] 1. Səsləri və ya rəngləri arasında uyğunluq (ahəng) olan; qulağa (gözə) xoş gələn, qulaqları (gözləri) oxşayan, gözəl səslənən; ahəngli, xoş, lətif. *Ahəngdar səs. Ahəngdar şeir. Ahəngdar nəğmə.* – *Əncir ağacı altında inləyən sazın ahəngdar səsi ətrafı bürümüşdü.* A.Şaiq. *Sabahın bu ahəngdar musiqisini ordan-burdan ucalan insan bağırtıları, at kişnəmələri, şeypur nidaları pozurdu.* M.Rzaquluzadə.

2. *məc.* Uyğun, müntəzəm, qaydalı, səlis. *Canlı orqanizmin ayrı-ayrı üzvləri həmişə bir-biri ilə ahəngdar* (z.) *işləyir.* – *Harada isə, lap uzaqda tənha bir traktorun ahəngdar tırıltısı eşidilirdi.* İ.Şıxlı. *Bəsti çox ahəngdar bir surətdə işləyirdi.* Ə.Sadıq.

**AHƏNGDARLIQ** *is.* 1. Səslər və s. arasında uyğunluq. *Musiqinin ahəngdarlığı. Nəğmənin ahəngdarlığı. Səslərin ahəngdarlığı.* – *Şerim sərbəstdir bir qədər; Birdən ahəngdarlıq sevən Xəzər; Məndən küsər.* M.Araz.

2. Uyğunluq, müntəzəmlik. *Bədən tərbiyəsi və idmanla müntəzəm məşğul olmaq hərəkətlərin ahəngdarlığına da olduqca gözəl təsir göstərir.*

**AHƏNGLƏNDİRMƏ** "Ahəngləndirmək"-dən *f.is.*

**AHƏNGLƏNDİRMƏK** *f.* Ahəngə salmaq, müəyyən ahəngə tabe etmək; səsləri və s.-ni bir-birinə uyğunlaşdırmaq.

**AHƏNGLƏŞDİRMƏ** "Ahəngləşdirmək"-dən *f.is.*

**AHƏNGLƏŞDİRMƏK** b a x **ahəngləndirmək.**

**AHƏNGLİ** b a x **ahəngdar.** *Gecə sakit və sirli görünürdü. O, sanki min ahəngli cazibədar bir musiqi ilə insanları oxşayır, .. ürəklərini yumşaldırdı.* M.İbrahimov.

**AHƏNGLİLİK** b a x **ahəngdarlıq**.

**AHƏNGSİZ** *sif.* Səsləri və ya rəngləri arasında uyğunluq (ahəng) olmayan, qulağa (gözə) xoş gəlməyən. *Ahəngsiz nəğmə, şeir, musiqi, rəsm.* // Uyğunsuz.

**AHƏNGSİZLİK** *is.* Səslər və ya rənglər arasında uyğunluq (ahəng) olmaması. *Nəğmənin, şerin, musiqinin ahəngsizliyi. Rənglərin ahəngsizliyi.*

**AHƏNRÜBA** *is.* [*fars.*] b a x **maqnit.** *Ahənrüba – yunanca miqnatis, rusca maqnit, bu bir cövhərdir ki, dəmiri cəlb edir.* C.Məmmədquluzadə. *Məlumdur ki, ahənrübani dəmirin yanına gətirəndə onu çəkir.* H.Zərdabi. // *məc.* Cəzbedici qüvvə, cazibə. *Onda sanki ahənrüba var idi. – Könül qərq oldu əşki-alə, lakin tazə can tapdı; Su içrə qalsa da xasiyyəti-ahənrüba getməz.* S.Ə.Şirvani. *Bu sözlər elə bil hamını ahənrüba kimi özünə çəkdi.* S.Rəhman.

**AHƏSTƏ** *sif.* və *zərf* [*fars.*] Asta, yavaş, ağır, üsullu. *Dərənin hər iki tərəfindən bitmiş yüzillik palıd və fıstıq ağaclarının budaqları ahəstə əsən nəsimdən hərəkətlidir.* M.F.Axundzadə. *Ey dil, amandı, sirrini biganə bilməsin; Ahəstə zülfi-yardə yat, şanə bilməsin!* M.Ə.Sabir. [İlyasov] *bir az cəsarətsizlik hiss olunan ahəstə səslə əlavə etdi.* Mir Cəlal.

**ahəstə-ahəstə** *zərf* Yavaş-yavaş, ağır-ağır. *Göyün ulduzları da guya bir-biri ilə məhəbbətdən dəm vururdular. Bədirlənmiş ay bunların arasında ahəstə-ahəstə məbhut gəzib, dünyaya tamaşa edirdi.* Ə.Haqverdiyev. *Günəş dağın dalından ahəstə-ahəstə çıxırdı.* S.S.Axundov.

**AHƏSTƏCƏ** *zərf* Astaca, astalıqla, yavaşca, yavaş-yavaş, üsulluca. *Çox soyuqdur çıxan ahəstəcə tək-tək nəfəsi; Bədənində donuşub laxtalanır qan, ölüb-ə!* M.Ə.Sabir. [Məşədi Əsgər] *ahəstəcə qapını açıb içəri girdi.* S.M.Qənizadə. // Pəsdən, yavaşdan. *Gülxar ahəstəcə mahnı oxuyurdu.* Ə.Vəliyev.

**AH-FƏĞAN, AHÜ FƏĞAN** b a x **ah-nalə, ahü nalə** 2-ci mənada. *Könlüm quşu görəndə çü zülfün kəməndini; Ahü fəğanü nalədə biixtiyardır.* Heyran xanım. *Sınıbdır xatirim səndən, dəxi ahü fəğan etməz.* S.Ə.Şirvani. *Hər tərəfdən ucaldı ahü fəğan.* H.Cavid.

**AH-FƏRYAD, AHÜ FƏRYAD** b a x **ah-nalə, ahü nalə.** [Paşa bəy:] *..Mənə heç olmasa bir yadigarın qalsa idi, bu qədər ah-fəryad eləməzdim.* Ə.Vəliyev.

**AHIL** *sif.* [*fars.*] Yaşa dolmuş, yaşlı, qocalmağa başlayan, qocalıq əlamətləri göstərməyə başlayan. *Ahıl kişi. Ahıl arvad. – Neçə nəfər ahıl və cavan qadınlar arxalarında səhəngləri gəlib səhnədən keçmək istəyirlər.* Ə.Haqverdiyev. [Hacı Fərəc:] *Necə bilirsən, kərbəlayı, Zinyət xanım bir cavan oğlana getsə yaxşıdır, yoxsa bir ahıl, namaz qılan Allah bəndəsinə getsə?* N.Vəzirov. // İs. mənasında. *Eşitdim ahılların şirin zümzüməsini; Dinlədim lay-lay deyən anaların səsini.* Ə.Cəmil. *Yorulmuş gəncləri evdə çörək yeyib qayıdan ahıllar əvəz edirdilər.* M.Hüseyn.

**AHILLANMA** "Ahıllanmaq"dan *f.is.*

**AHILLANMAQ** b a x **ahıllaşmaq.**

**AHILLAŞMA** "Ahıllaşmaq"dan *f.is.*

**AHILLAŞMAQ** *f.* Yavaş-yavaş yaşa dolmaq, qocalmağa başlamaq.

**AHILLIQ** *is.* Ahıl adamın halı.

**AH-NALƏ, AHÜ NALƏ** *is.* Fəryad, ağlama, ah-vay, ağlayıb-zarıma. *Hərbilər dərhal ah-nalə edən Musa kişinin üstünə atıldılar. Onu götürüb aparmaq istədilər.* M.İbrahimov. *O biri otaqda Səlimnaz arvadın ah-naləsi ucaldı.* M.Hüseyn. ◻ **Ah-nalə etmək** – fəryad etmək, ağlamaq, ağlayıb-zarımaq.

**AHU** *is.* [*fars.*] 1. Ceyran. *Ətirlərimizin əlası müşkdür ki, ahunun göbəyinin qanın-*

*dan ibarətdir.* C.Məmmədquluzadə. *Məstan bir qaçan ahuya dönüb, indi kəməndə gəlmir.* S.Rəhimov.

2. Şairanə təşbihlərdə: dilbər, gözəl. *Aşiqi-dilxəstəni hərdəm sorar, ahu gəlir.* Xətayi. *Möcüz budur ki, ahuya ahu şikardır.* Heyran xanım. ☐ **Gözləri ahu, gözü ahu** – b a x **ahugözlü**. *Ey badi-səba, qasidi-müşkinə rəvayih; Ol gözləri ahuyə qıl əhvalımı vazih.* S.Ə.Şirvani. **Ahu gözlər** – iri və gözəl gözlər. *Vaqif geyinib otaqdan çıxdı və yenə gözucu arvadını süzdü: qara, ahu gözlərdə odlu yaşlar parlayırdı.* Çəmənzəminli.

◊ **Ahuyi-xəta, ahuyi-xətən** – əsil mənası "Çin ahusu" olub, klassik şeirdə gözələ, dilbərə işarədir. *Bənzər ahuyi-xətayə rəvişin filcümlə; Yoxsa tərzi-nigəhi nərgisi-şəhla nə bilir?* Q.Zakir. *Çin əhlinə göstər gözəlim, çeşmlə zülfün; Fəxr etməsin ahuyi-xətən, müşki-tərim var.* Ə.Vahid.

**AHUBAXIŞLI** *şair.* b a x **ahugözlü.**

**AH-UF** b a x **ah-vay**. *Arvad o qədər ah-uf elədi ki, az qaldı bağrı çatlasın.* Ə.Vəliyev.

**AHUGÖZLÜ** *sif. şair.* İri və gözəl gözləri olan (qadın, qız haqqında). *Apardı ağlımı bir ahugözlü; Bir bənövşə boylu, bir laləüzlü.* M.V.Vidadi. *O ahugözlü, deyirlər, bu gün şikarə gedib; Alıbdı səbrü qərarımı aşikarə gedib.* S.Ə.Şirvani.

**AHUYERİŞLİ** *sif. şair.* Gözəl yerişli (klassik ədəbiyyatda gözəlin epitetlərindən biri).

**AH-VAY, AHÜ VAY** *is.* Dərd, kədər, qüssə, qəm. *Çox etdi mənçün ah-vayı; Gözündən axıtdı dürlü çayı.* Xətayi. // Fəryad, fəğan. *..Getdikcə şəhərin hər tərəfini saran fəryad və ah-vay səslərini eşidirdik.* M.S.Ordubadi. *Mən az görməmişəm bu sarayları; Burda göyə çıxan ahü vayları.* S.Vurğun. ☐ **Ah-vay etmək** – kədərlənmək, dərdlənmək, dərd və qüssədən şikayətlənmək. // Fəryad etmək. *Yeni məhbus uzun müddət ah-vay etmiş, .. düşdüyü yerdə yatıb qalmışdı.* M.İbrahimov.

**AH-VAYÇI** *sif.* Ah-vay edən, şikayətlənən, daim inildəyən, sızlayan. *Görünür, bu cür ah-vayçı nitqlər yığıncaqdakıların zəhləsini tökmüşdü.*

**AH-ZAR, AHÜ ZAR** *is.* Ah çəkmə, sızlama, zarıldama; fəryad, inilti. *Ey yüzi gülşən, sana bu ah-zarım xoşmudur?* Nəsimi. *Nə vaxtadək ğəmi-hicrində ahü zar çəkim?* X.Natəvan. *Çəməndə bülbül oxur, ya fəğani-Seyyiddir? Gənə bu nəğmə onun ahü zarına bənzər.* S.Ə.Şirvani. *Nədir sənin dərdin, bu nə ahü zardır?* Ü.Hacıbəyov. ☐ **Ah-zar etmək (eləmək)** – ah çəkmək, sızlamaq, zarıldamaq, fəryad etmək, inildəmək. *Günahsız dustaq ah-zar eləməyə başladı.* M.F.Axundzadə.

**AX** *nida.* 1. Təəccüb, təəssüf, arzu, həsrət və başqa hissləri bildirir (bəzən təkrar şəklində işlənir). *Ax, az qala yadımdan çıxmışdı. Ax, nə gözəldir! – Ax, necə kef çəkməli əyyam idi!* M.Ə.Sabir. [Əvvəlinci azarlı:] *Ax! Ax! Vallah, bilmirəm ki, bu nə dərddi ki, gəlib yapışıb yaxamdan.* C.Məmmədquluzadə. [Sara:] *Ax, fələk! Bu nə fəlakətdir məni saldın, mən ki ömrümdə bir kəsi incitməmişəm.* C.Cabbarlı.

2. Məzəmmət, töhmət, danlaq bildirir. [Ağa Mərdan:] *Ax, məlun gör nə mərtəbədə qaim və xəsis adamdır.* M.F.Axundzadə. [Əşrəf:] *Ax, onun əlindən nələr çəkmədim?* A.Şaiq.

**AXAN** *f.sif.* 1. B a x **axar** 1-ci mənada. [Salam] *lal axan kəhriz suyundan ovuc dolusu içdi.* Mir Cəlal.

2. *məc.* Süzgün, xumar. *Yuxusuz maraltək hərdən süzülüb; Axan gözlərinin sədəqəsi canım.* Q.Zakir.

◊ **Axan ulduz** – fəzalardan çox iti sürətlə yerə düşən və bu zaman güclü işıq verən göy cismi.

**AXAR** 1. *sif.* Daim axan (*axmaz* əksi). *Axar su. Axar çay. Axar bulaq. – Sevgili bir çoban, on bir yaşında; Düdük çalır axar sular başında.* H.Cavid. *Yenə axar çaylar üstdə dəmir körpü qurulacaq.* S.Vurğun. *Səltənət axar su axtarırdı.* Mir Cəlal.

2. *is.* Cərəyan səmti, istiqaməti. *Suyun axarı. Çayın axarı ilə getmək.*

3. *məc.* Səlis, rəvan, ahəngdar. *Noldu söylədiyin axar qoşmalar; Andımı həsrətlə səni hər nigar?!* S.Vurğun.

**AXAR-BAXAR** *is.* 1. Hər tərəfi açıq və xoş mənzərəli yer, göz işlədikcə görünən

yer; mənzərə. *Əlli beş evdən ibarət olan bu kəndin çox gözəl və qəşəng axar-baxarı vardı.* Ə.Vəliyev.

2. Suayırıcı; iki çay və ya su hövzəsini bölən xətt.

**AXAR-BAXARLI** *sif.* Hər tərəfi açıq və xoş mənzərəli. *Alaçığımız obadan bir az uzaq, atamın bəyəndiyi axar-baxarlı gözəl bir yerdə quruldu.* A.Şaiq.

**AXARLI** *sif.* 1. *xüs.* Hərəkət zamanı havanın müqavimətinə daha az məruz qalmaq üçün müvafiq bir formada düzəldilmiş (avtomobil, təyyarə haqqında). *Təyyarənin qanadı hava üçün xüsusilə axarlı* (z.) *qayrılmışdı.*

2. Bir tərəfdən axar yeri olan, durğun olmayan. *Axarlı göl.*

**AXARLIQ** *is.* 1. Qərarsızlıq, səbatsızlıq, tez-tez dəyişmə. *İşçi qüvvəsinin axarlığı.*

2. *məc.* Səlislik, ahəngdarlıq, rəvanlıq. *Şerin axarlığı. Musiqinin axarlığı.*

**AXÇA** b a x **ağça**.

**AXÇASIZ** b a x **ağçasız**.

**AXDIRMAQ** "Axmaq"dan *icb.*

**AXI** *əd.* Əvvəlki fikri əsaslandırmaq, yaxud bir şeyi sübut etmək, ifadəni gücləndirmək üçün söylənir, bəzən etiraz, narazılıq, məzəmmət, bəzən də xahiş, təkid bildirir. *Niyə belə yubanırsan, axı işə gecikirsən. Axı bu bir həqiqətdir. Axı o təhlükədədir, ona tez kömək etmək lazımdır.* – [Ağa Kərim xan:] *Zalım oğlu, deyəsən, pulların yerini bilib, axı...* N.Vəzirov. [Zeynəb:] *Axı, qardaş, mən yorulmuşam.* S.S.Axundov. [Verdiyev:] *Beş kişinin biriyəm axı, niyə məni tay-tuş içində yerə vurursan!* Mir Cəlal. [Xavər:] *Əzizim, .. bax, bu balaca üçün özünü gözləməlisən, axı sənsiz onun axırı nə olar?* M.İbrahimov.

**AXICI** *sif.* 1. Axmağa qabil olan; duru. *Axıcı cisimlər.*

2. *məc*. Səlis, rəvan. *Bütün əsər boyu istər yazıçının təsvirlərində, istərsə surətlərin danışığında axıcı, ahəngdar, gözəl Azərbaycan dilinin musiqisi qulağımıza dəyir.* M.İbrahimov. *Bütün müdərrislərimiz ondakı* [Həsəndəki] *səlis, axıcı natiqlik məharətinə qibtə edirdilər.* İ.Əfəndiyev.

**AXICILIQ** b a x **axarlıq**.

**AXIDILMA** "Axıdılmaq"dan *f.is.*

**AXIDILMAQ** "Axıtmaq"dan *məch.*

**AXIM** *is.* Axma, axıntı.

**AXIN** *is.* 1. Sürətlə axan su; sel; iti cərəyan, güclü axan su, selab. *Yağışdan əmələ gələn axın yolları xarab etdi.* // Cərəyan, suyun axıb getdiyi tərəf. *Çayın axını ilə üzmək. – Sən ki son nəfəsinlə vətəni andın; Çayların axını dayandı bir an.* S.Vurğun. // Axma. *Lənkəran, Naxçıvan və Kür-Araz ovalıqlarından axan çaylar, onların axın şəraiti, dərələrinin xarakteri və s. bir-birindən fərqlidir.* M.Qaşqay.

2. Məftildə elektrik cərəyanının hərəkəti.

3. *məc.* Arası kəsilmədən hərəkət edən insan və s. kütləsi, izdiham. *Canlı insan axını. Axının qabağını dayandırmaq. – Axının kənara atdığı Ayaz da fəryad qopardı.* M.İbrahimov. *Baxınız, qarşımı tutmuş bir axın; Güclüdən güclü, dənizdən daşqın.* M.Müşfiq. ☐ **Axına qoşulmaq** – əksəriyyətə tabe olmaq. *Şahnisə xanım çıxılmaz bir vəziyyətdə qalıb, nə "hə", nə "yox" deyir, istər-istəməz axına qoşularaq deyilənlərə tabe olurdu.* Çəmənzəminli.

4. *məc.* Gediş, cərəyan. *..Həyatın təbii axını onu* [Səriyyəni] *bir kor kimi istədiyi səmtə sürükləyirdi.* M.İbrahimov.

5. Hücum, basqın, həmlə. *Düşmən qoşunlarının axını dayandırıldı. – Burada çox oynadı qılınclar, qınlar; Ordular, karvanlar, başsız axınlar.* S.Vurğun.

6. *məc.* Qərarsızlıq, tez-tez dəyişmə. *Zavodda işçi qüvvəsi axını çox böyükdür.*

**axın-axın** *zərf* Sel kimi bir-birinin ardınca, arasıkəsilməz axın kimi; aramsız. *Bakılılar hər axşam axın-axın dənizkənarı bulvara çıxırlar. – Ətəkli çöllərdən hey axın-axın; Qalxan dolaşalar qaqqıldaşaraq; ..Başımın üstündə dövrələr vurur.* S.Vurğun.

**AXINÖLÇƏN** *is. xüs.* Axının gücünü, istiqamətini və s. xüsusiyyətlərini müəyyən etmək üçün cihaz. *Avtomatik dalğaölçən və axınölçən cihazları ekspedisiya üzvləri ixtira etmişlər.* Qəzetlərdən.

**AXINTI** *is.* 1. Bir tərəfə doğru hərəkət edən su, hava, yaxud elektrik kütləsi cərəyanı.

2. Su ilə axıb bir yerə yığılan şeylər, suyun özü ilə gətirdiyi şeylər.

**AXINTILI** *sif.* Axar, axıntısı olan, suyun axar yeri olan. *Axıntılı göl. Axıntılı hovuz.*

**AXIR** is. 1. Son, nəhayət; bir şeyin son nöqtəsi, qurtaracağı. *Yolun axırı. İşin axırı. Qışın axırı. İclasın axırı. Mahnının axırı. İlin axırına az qalır. Şəhərin axırında yaşayıram.* – [Mirzə Fətəli:] *Hər bir qaranlığın axırı işıqdır.* Ə.Haqverdiyev. // *sif.* Axırıncı, sonuncu. *Axır sözün nədir? – Bu il nə cür olursa məktəbə getməyi qərara almışdım. Yayın axır ayından anamın qulağını doldurmağa başladım.* M.İbrahimov.

2. Aqibət, nəticə, son. *İşin axırı necə oldu? Bu uşağın axırı necə olacaq?* – [Miraxur:] *Heyif ki, sən də arvad felinə düşübsən. Gəl bu daşı ətəyindən tök! Axırı yoxdur.* Çəmənzəminli. [Turac:] *Kitabda yazılan sevgilərin axırı eyzən dava-şava olur.* İ.Əfəndiyev.

3. Axırda, nəticədə, nəhayət(də) (bəzən "axırı" şəklində işlənir). *Geyinmisən yaşıl üstdən alı sən; Axır bizi eşq oduna salısan.* (Qoşma). *Öldürdün axır, məndəki can qalmadı əsla.* M.P.Vaqif. *Ey gül, sənə əvvəldə xiridar mən oldum; Axır nəzərində hamıdan xar mən oldum.* S.Ə.Şirvani. *Axırı biçarə ananız sizə deyirdi: – Bala, ağlama, xortdan gələr səni aparar!* C.Məmmədquluzadə.

4. *məc.* Ölüm, son nəfəs. *Onun axırına az qalıb.* – [Rus qızı:] *Təəssüf ki, mən sənə qoşula bilməyəcəyəm. Hiss eləyirəm ki, axırımdır.* C.Məmmədquluzadə.

5. B a x **axı**. *Bahari-zahirin axır nədir tamaşası; Həmişə dildə sənin solmayan baharın var.* S.Ə.Şirvani. *Axır nə səbəb söz deməyə qüdrətin olsun?* M.Ə.Sabir. [Mirzə Məmmədəli:] *A kişi, mən bilmirəm ədib nədi, axır ey!* C.Məmmədquluzadə. [Kəndlilər:] *Bəy, axır yağış yağmayır, nə etməli?* Ə.Haqverdiyev.

◊ **Axır çərşənbə** – Novruz bayramı ərəfəsinə düşən sonuncu çərşənbə günü. *Novruz bayramına az qalırdı. Şəhərdə axır çərşənbələri bayram edirdilər.* M.İbrahimov. **Axır ki** – b a x **axırı ki** ("**axırı**"da). **Axır qoymaq** – son qoymaq, nəhayət vermək. [Şamo:] *Bu vurhavura bir axır qoymaq olacaqmı?* S.Rəhimov. **Axır nəfəs** – ölüm. *Etdim axır nəfəsimdə ləbi-canana təmə; Ölürəm, eybi nədir, gər eləsəm canə təmə.* S.Ə.Şirvani. [Səlimnaz xanım:] *Bu saat hazır olur; çaysız hara gedirsiniz! ..Saat üçəcən ac qalsan gündə, axır nəfəsin olar.* N.Vəzirov. **Axıra qalmaq** – Bir şeyin sırasında sonuncu, ən axırdakı olmaq, ən axırda gəlmək. **Axıra yetirmək (çatdırmaq)** – qurtarmaq, tamamlamaq, başa çatdırmaq. *Lağlağı .. sözümü kəsib, qoymadı vərəqi axıra yetirəm; mən sakit oldum və o özü başladı oxumağa.* C.Məmmədquluzadə. **Axıra yetmək (çatmaq)** – qurtarmaq, tamamlanmaq, başa çatmaq. **Axırı bir yana çıxmaq** – bir nəticə vermək, bir şeylə nəticələnmək. [Nəcəf bəy:] *Gedib orada işləsin, bəlkə axırı bir yana çıxa.* Ə.Haqverdiyev. **Axırı xeyir olmaq** – nəticəsi yaxşı olmaq, xoşbəxtliyə, ağ günə çıxmaq. **Axırı xeyir olsun!** – birisinə uğurlar, yaxşılıq diləmək üçün deyilir. **Axırı olmaq** – 1) bitmək, qurtarmaq; 2) gələcəyi olmaq, nəticəsi olmaq, sonu olmaq; 3) əldən düşmək, üzülmək, yorulmaq. **Axırına daş atmaq, axırına çıxmaq** – 1) məhv etmək, yox etmək, puç etmək. *Bu qədər fitnə və feil tamam sənin işin imiş, Allah qoysa, sənin axırına çıxaram!* M.F.Axundzadə; 2) qurtarmaq, hamısını işlətmək, ya xərcləmək (boş yerə, səmərəsiz). **Axırını eləmək** – öldürmək, işini bitirmək. [Şirin:] *Hələ dur! Dur, yoxsa axırını elərəm...* N.Vəzirov. *Yoxsa mənim axırımı eləməyə gəlibsən?* Ə.Haqverdiyev. **Dünyanın axırı** – qiyamət. [Feyzi:] *Yəqin dünyanın axırıdır!* Ə.Haqverdiyev.

**axır-axırda** b a x **axırda** 2-ci mənada. *Köhnə ili yaxşı başa vurmuşdum, amma axır-axırda işlər korlandı.* "Kirpi".

**AXIRDA** *zərf* 1. Hamıdan sonra, qurtaracaqda. *Axırda duran kimdir?*

2. Nəticədə, ən nəhayətdə, bir şeyin nəticəsində, nəhayət. *Axırda dilə gəlib cavab verdi. O, axırda özü avara qalacaqdır. Axırda bildiyi yadından çıxacaq. – Ey xuda, kim çəkər axırda gülabın o gülün; Dərdisər dəfinə aləmdə bu dərman gülüdür.* S.Ə.Şirvani. *Muzdur çamadanı qabağına alıb, açar yerini mismar ilə qurdalamağa başlayıb, axırda açdı.* S.M.Qənizadə. *Axırda hər yandan qarğa-quzğun kimi dövlətlilər tökülüb şeyxi yatırtdılar.* M.İbrahimov.

**AXIR-ƏZƏL** *zərf* [*ər.*] Tez-gec, mütləq, nəhayətdə. *Heç nə istəmərəm iki dünyada; Sənsən mənim axır-əzəl, sevdiyim.* M.P.Vaqif.

**AXIRI** b a x **axırda** 2-ci mənada. *Axırı bir gün atası rəhmətlik hesabdar Gəldiyevi ayıltdı.* Mir Cəlal.

**AXIR(I) Kİ** – gözlənilən bir hadisə baş verdikdə deyilir; nəhayət. *Axırı ki, duman seyrəkləşdi. Elə bil, üfüqdən-üfüqə uzanan boz bir pərdəni yuxarı qaldırıb çadır kimi başımızın üstündən asdılar.* R.Rza.

**AXIRINCI** *sif.* 1. Bir şeyin sırasında sonuncu, ən axırdakı; ən axırda olan (gələn). *Axırıncı tamaşa. Axırıncı dərs. Küçədə axırıncı bina. Axırıncı qurtum. Axırıncı dəfə. Axırıncı iclas. Axırıncı aşırım. Həftənin axırıncı günü. – ..Günün axırıncı şəfəqi uca ağacların başını qızıl rəngində etmişdi və nazik yel yavaş-yavaş əsib yarpaqları tərpədirdi.* N.Nərimanov. *Axırıncı sözləri eşidəndən sonra Mahmud .. arxayın ola biləcəyini yəqin etdi.* Ə.Əbülhəsən. // İs. mənasında. *Axırıncı kimdir? Axırıncı mənəm. Axırıncı da getdi.*

2. Ailədə hamıdan kiçiyi. *Ailədə axırıncı uşaq. Axırıncı oğul. Axırıncı övlad.*

3. Qəti, son, qurtaracaq. *Axırıncı qiymət. Mən hələ axırıncı sözümü söyləməmişəm. Bu mənim axırıncı qərarımdır.*

4. Ən yeni, ən təzə, yenicə meydana çıxmış, son. *Axırıncı moda. Texnikanın axırıncı nailiyyəti. Elmin axırıncı sözü.*

5. Ən pis, ən əhəmiyyətsiz. *Axırıncı yerdə durmamaq üçün gecə-gündüz çalışmaq lazımdır.* // Daha az əhəmiyyəti olan. *Axırıncı rolları ifa etmək.*

**AXIRSIZ** *sif.* 1. Sonsuz, nəhayətsiz; sonu, həddi olmayan.

2. Son dərəcə uzun, sürəkli, bitməyən.

3. Nəticəsiz, aqibətsiz.

**AXIRSIZLIQ** *is.* 1. Sonsuzluq, nəhayətsizlik; sonu, nəhayəti olmama.

2. Nəticəsizlik, aqibətsizlik.

**AXIR-UXUR** *sif.* və *is. dan.* Son, axır. *Münəvvər xanım süfrə açanda əri, sanki kiminləsə savaşmasının axır-uxurunu danışırdı.* Mir Cəlal. // Son qalıq.

**AXIRZAMAN** *is. din.* Dünyanın axırı, qiyamət. *Axırzamandı, bir qulaq as, ərşi titrədir; Millətlərin haray-mədədi, əl-aman səsi.* Şəhriyar.

**AXIŞ** *is.* Axma, axma tərzi. *Dağların yağışından; Rəngindən, axışından; Bu gediş ömürlükdür; Duymuşam baxışından.* (Bayatı). *Gümüş xəncərə bənzər dağ döşündən axan çay; O çayların axışı şerimə olarmı tay?* S.Rüstəm. *Kür sakit axıb gedir, axışı ürəyimdə; İzlər buraxıb gedir.* M.Rahim.

**AXIŞMA** "Axışmaq"dan *f.is.*

**AXIŞMAQ** *f.* 1. Axıb bir yerə yığılmaq, hər tərəfdən axıb gəlmək, axıb tökülmək; axmaq. *Çöl suları axışıb dərəyə tökülür. – Qızdı günəş, əsdi isti yellər; Qarlar əridi, axışdı sellər.* A.Şaiq.

2. *məc.* Axın halına gəlmək, getmək, yayılmaq (bəzən "axışıb gəlmək" şəklində işlənir). *Böyük xalq kütləsi meydana axışırdı. – Yurdun hər bucağından igidlər, pəhləvanlar, oxatanlar, .. məşhur ozanlar axışıb gəlmişdi.* M.Rzaquluzadə. *Axşama yaxın şairin xaraba kəndə gəldiyi xəbəri .. kənd əhalisi arasında yayılırkən, hamı axışıb kəndə doğru üz tutdu.* Ə.Məmmədxanlı. *Minlərcə gənclər kitab üçün axışıb gəlirlər.* Mir Cəlal. // Pərakəndə halda hərəkət etmək, getmək. *Buludlar parçalanıb cənuba doğru axışmağa başladı.* Ə.Məmmədxanlı.

**AXITDIRMA** "Axıtdırmaq"dan *f.is.*

**AXITDIRMAQ** b a x **axdırmaq.**

**AXITMA** "Axıtmaq"dan *f.is.*

**AXITMAQ** *f.* 1. Axmasına səbəb olmaq. *Suyu axıtmaq. Südü axıtmaq. Qan axıtmaq* (adam öldürmək, ya yaralamaq). – *Göztək bulaqlardan, buztək suları; Axıdıb çaylara qatar o dağlar.* H.K.Sanılı.

2. Tökmək. *Ey Füzuli, axıdıb seyli-sirişk ağlıyalı; Eşq əhlinə fəğan etməyi qanun etdin.* Füzuli. *Axıtdım alnımın inci tərini; Yanmadım ömrümün iki ilinə.* S.Vurğun. ☐ **Göz yaşı, yaxud gözlərinin yaşını axıtmaq** – ağlamaq. *Lotular oturub bir qədər mərhumu yalanbaşdan yad edib, göz yaşı axıtdılar.* "Aşıq Qərib". *Şahməmməd adı eşidəndə pişxidmətin rəngi saraldı. Gözlərinin yaşını axıdaraq səcdəyə düşdü.* Çəmənzəminli.

3. *məc.* Çoxlu miqdarda və ardı-arası kəsilmədən göndərmək, yollamaq. *Hər beşdə, üçdə etdi, hər səmtə bir səyahət; Hər bir*

*səyahətində, seltək axıtdı sərvət.* M.Ə.Sabir. [Uluca:] *Başlayır kinə, çökür şən-şövkət; Axıdır Ruma xəzinə, sərvət.* A.Şaiq.

4. Axar su ilə göndərmək. *Çayla ağac axıtmaq.*

5. *məc.* Süzmək, baxmaq. [Qazı] *bir qədər qabağa gəlib qoşa ovcunu tutub qabağa və gözlərini yuxarı axıdıb..* C.Məmmədquluzadə.

**AXIZDIRILMAQ** *məch.* Azca-azca axıdılma, tökülmək.

**AXIZDIRMAQ** *f.* Azca-azca axıtmaq, tökmək.

**AXIZMAQ** b a x **axızdırmaq**.

**AXİRƏT** *is.* [*ər.*] Dini etiqadlara görə, öləndən sonra insanların düşəcəyi ikinci və əbədi dünya. *Ey xoş ol sərməst kim könlündə şövqü sövqdən; Axirət əndişəsi, dünya xəyalı qalmadı.* Füzuli. *Axirət sözünü salma yadına; Dürüst deyil mütləq etiqadına..* M.V.Vidadi. *Bizim həmməzhəbimiz olan elm və savad sahibləri indiyə qədər ancaq xalqın axirət mənafeyinə dair yazılar yazmışlar.* M.F.Axundzadə.

**AXİRƏTLİK** *is.* 1. Axirətə mənsub olan.

2. Dinə sadiq qalmaqla və öz əməllərilə axirəti qazanmış adam.

**AXİRƏTSİZ** *sif. din.* Dinsiz, imansız, günahkar. [Şirin:] *Paho, paho! Nurcahan qarı, axirətsiz, nə tez xam yerə şikarə çıxmısan?* N.Vəzirov.

**AXİRÜLƏMR** *ara söz* [*ər.*] Axırda, nəticədə, işin axırında, ən nəhayət. *Axirüləmr, məsələ anlaşıldı.* C.Məmmədquluzadə. [Məşədi Əsgər] *axirüləmr naümidliklə yenə öz evi tərəfə üz döndərib Qanlı təpə üstünə qayıtdı.* S.M.Qənizadə. *Axirüləmr Aslan naçar qalıb Sitarənin sözlərinə razı olmağa məcbur oldu.* C.Cabbarlı.

**AXMA** "Axmaq¹"dan *f.is.*

**AXMAQ¹** *f.* 1. Bir istiqamətdə getmək, cərəyan etmək (mayelər və hava haqqında). *Çay axır. Su axır. Damarlarda qan axır. – Ərir dağın, çölün qarı; Axır dərələrə sarı.* A.Səhhət. [Tahir] *pəncərədən içəri axan təmiz havada xumarlana-xumarlana yuxuya getdi.* M.Hüseyn.

2. Sızmaq, xarab olduğu üçün mayeni buraxmaq. *Dam axır. Qab axır. Kran axır.*

3. Damcı-damcı tökülmək (axmaq). *Qapında inləyim mən; Sözü de, dinləyim mən; Qoy axsın gözüm yaşı; Bir az sərinləyim mən.* (Bayatı).

4. *məc.* Gəlmək, tökülmək. *Alovlar dağıdan xoş nəfəsindən; Hər əsgər qəlbinə min qüvvət axdı.* S.Vurğun. [Mürsəl kişi] *qəmli ürəyinə axan bir sevincin təsiri ilə gülümsündü.* M.Hüseyn.

5. *məc.* Qüvvətli kütlə və ya izdiham halında hərəkət etmək, irəliləmək, yerimək, getmək, gəlmək. *Qoşunlar ardı-arası kəsilmədən axıb gedirdi. – Nəhayət, kəndlilərdən biri ayını tüfəng ilə vurub öldürüncə qələbəlik ayının yuvasına doğru axdı.* A.Şaiq. *Hamısı dönüb geriyə baxdı, bəziləri isə səs gələn tərəfə axıb getməyə başladı.* M.S.Ordubadi. *Bu təklifi qəbul edərək xalq saray meydanına tərəf axmağa başladı.* S.S.Axundov.

6. *məc.* Sakit, müntəzəm hərəkət etmək. *Buludlar sakit-sakit göydə axır.* // Səlislik, ahəngdarlıq mənasında. *Musiqinin səsi axır.*

7. *məc.* Getmək, ötmək, keçmək (bəzən "axıb getmək" şəklində işlənir). *Vaxt çox tez axıb gedir. Həyat öz qaydası ilə axıb gedir. Hər şey axır, hər şey dəyişir. – Bu vəfasız ömür, bu coşqun dərə; Gərək boş-boşuna axıb keçməsin.* M.Müşfiq. *Fikrində, hissində inqilab yarat; Anla ki, hər zaman axır bu həyat!* S.Vurğun. // *məc.* Cərəyan etmək, başa gəlmək, keçmək. *Həyat öz məcrası ilə axır.*

8. Suyun üzü ilə, cərəyanı ilə getmək; cərəyan aparmaq. *Qayıqlar sahil yanından axıb keçdi.*

9. *məc*. Süzgün göz haqqında. *Min yerdən "can!" deyildi; Hər axan süzgün gözə.* Ə.Cavad. // Özündən gedən, can verən adamın gözləri haqqında.

**AXMAQ²** *sif.* Səfeh, ağılsız, gic. *Axmaq adam. – Əlhəq, münəccimbaşı dəxi görünür ki, çox axmaq imiş.* M.F.Axundzadə. // Mənasız, boş (söz, hərəkət, iş və s.). *Axmaq hərəkət. Axmaq iş tutmaq. Axmaq fikir.* – [Rüstəm bəy:] *Həsənqulu bəy, Rza bəy, sizin üçün eyib olsun ki, bu cürə axmaq sözə inanıb, mənim qapıma gəlirsiniz.* Ü.Hacıbəyov. [Tarverdi:] *Mən özüm də istəməzdim onun axmaq sözlərini söyləyim.* C.Cabbarlı. // Zərf mənasında. [Tubu:] *Axmaq danış-*

*mıram, sözün gerçəyini mən deyirəm.* Ə.Haqverdiyev. // Bəzən söyüş kimi işlənir.

**axmaq-axmaq** *zərf* [Həmzə bəy:] *Biri bir axmaq söz dedi, gərək bunlar da oturub ona axmaq-axmaq gülələr.* Ə.Haqverdiyev.

**AXMAQCA(SINA)** *zərf* Axmaq kimi, ağılsızcasına. *Axmaqcasına hərəkət etmək. Axmaqcasına inanmaq. Axmaqcasına tərslik etmək.*

**AXMAQLAMA** "Axmaqlamaq"dan *f.is.*

**AXMAQLAMAQ** *f.* Səfehləmək, ağlını itirmək, gicləşmək, xərifləmək. // Axmaq iş tutmaq, axmaqca hərəkət etmək, axmaqca sözlər danışmaq. [Soltan bəy:] *Axmaqlama, axmaqlama! Gəl bəri, gedək o biri otağa, gör sənə nələr söyləyəcəyəm.* Ü.Hacıbəyov.

**AXMAQLAŞMAQ** *f.* Getdikcə ağlı azalmaq, gicləşmək, xərifləmək, səfehləşmək.

**AXMAQLIQ** *is.* Səfehlik, ağılsızlıq, giclik. *Axmaqlığından başına bu işlər gəldi. – Bunlarda yeganə bir fikir, müstəqil bir əqidə axtarmaq, cahillik və axmaqlıqdır.* M.S.Ordubadi. // Axmaq hərəkət, axmaq iş. ☐ **Axmaqlıq etmək** – axmaq iş tutmaq, ağılsızlıq etmək, axmaq hərəkət etmək, anlamazlıq göstərmək. [Mərcan bəy:] *Qabaqda axmaqlıq edib, kəbin pulunu beş min manat yazdırmışam.* Ü.Hacıbəyov.

**AXMAZ** 1. *sif.* Axmayan, durğun (su haqqında).

2. *is.* Durğun su, çuxur yerlərdə yığılıb qalan su. *Pambıq yerlərində tarlaları suvarmaq üçün axmazların suyundan da istifadə edilir. – Çayın çox girintili-çıxıntılı olması və allüvial çöküntülərin asanlıqla yuyulması nəticəsində bir sıra axmazlar və köhnə çay yataqları əmələ gəlmişdir.* M.Qaşqay. *Bir azdan artıq bataqlığın və axmazların əvəzinə yamyaşıl çöllər görünməyə başladı.* S.Rəhman.

**AXNAŞMAQ** *f. məh.* Axışıb gəlmək, izdihamla gəlmək, axışmaq. *Kişi və övrət, qoca və uşaq, hətta dördayaqlılar şəhərin kənarına axnaşıb getməkdədir.* C.Məmmədquluzadə.

**AXSAQ** 1. *sif.* Bir qıçı qısa və ya əlil olan; topal, çolaq. *Axsaq adam. Axsaq at. – Köç dala qayıdanda axsaq keçi qabağa düşər.* (Ata. sözü). *İki axsaq tulanı da salırsan dalına, canım kəhər, gözüm kəhər, düşürsən biyabanın, düzün canına, nədi-nədi, bəy ova çıxıb.* Ə.Haqverdiyev. *Əbu İmran dərhal adamlarını yarıb bir az axsaq yerişilə irəli çıxdı..* Ə.Məmmədxanlı.

2. *is.* Qoyunlarda çox, o biri heyvanlarda isə az təsadüf edilən yoluxma xəstəlik (ayaq xəstəliyi).

**AXSAQLIQ** *is.* Topallıq, çolaqlıq.

**AXSAQULAQ** *is. məh.* Yağ və sarımsaqlı qatıqdan hazırlanan bir yemək adı.

**AXSAMA** "Axsamaq"dan *f.is. Bəxtiyarın .. belə ibadəti Hacı Kərimin işlərinin axsamasına səbəb olurdu.* S.Hüseyn.

**AXSAMAQ** *f.* 1. Bir ayağının qısalığı və ya xəstələnməsi nəticəsində bir tərəfini çəkəçəkə yerimək, taytamaq.

2. *məc.* İrəliləməmək, yaxşı getməmək, ləng getmək, geridə qalmaq, işi yarıtmamaq. *İşlər axsayır. O, bilik cəhətdən axsayır. – Elektrik enerjisi çatmır və bunun nəticəsində də bəzi sahələrdə iş axsayırdı.* Ə.Sadıq.

◊ **Hər iki ayaqdan axsamaq** – işdə çoxlu nöqsan olmaq.

**AXSAR** *sif.* Axsaq, axsayan.

**AXSATMA** "Axsatmaq"dan *f.is.*

**AXSATMAQ** *f.* 1. Axsamağa səbəb olmaq, topal etmək.

2. *məc.* Ləngitmək, işin yaxşı getməməsinə, geridə qalmasına səbəb olmaq. *İşləri axsadan səbəbləri aradan qaldırmaq. İşləri axsadan nədir? –* [Zeynal] *özünün yaramaz hərəkətləri ilə ümumi şöbənin işlərini nə qədər axsatmış, bundan dolayı şöbə müdiri şəxsən bir-iki kərə töhmətə uğramışdır.* S.Hüseyn.

**AXŞAM** *is.* Günəşin batmasından gecənin başlanmasına qədər olan vaxt, günbatan vaxt. *Axşam növbəsi. Axşam məktəbi. Axşam İstanbula çatdıq. – Axşam vaxtları kəndin kənarında durub yaşıl çəmənlərə tamaşa eləyəndə görərsən ki, naxır üz qoyub kəndə gəlməyə.* C.Məmmədquluzadə. *Fələkzədə Məşədi Əsgər bu gün də uşaqlara baxmağa davam edə bilməyib, axşam vaxtı evdən çıxdı.* S.M.Qənizadə. ☐ **Axşam düşmək (qovuşmaq, enmək)** – hava qaralmaq, gün batmaq. *Uşaqların dördü də axşam qovuşanda, cücələr ana toyuğa qısılan kimi, qıçından, tumanın ətəyindən tutaraq ona* [analarına] *qısılmışdı.* M.İbrahimov. *Sakit Azərbaycan*

*kəndi üzərinə bir yaz axşamı enirdi.* Ə.Məmmədxanlı. *Axşam düşdü, evdə ağ çıraq yandı.* S.Rəhimov. **Axşam eləmək** – axşama qədər keçinmək, axşama qədər qalmaq, axşamlamaq, günü keçirmək. **Axşam yeməyi** – axşam yeyilən xörək; şam. *Axşam yeməyini yedikdən sonra, axşamlar hər məhəllənin qonşuları qum üstünə yığılıb, məşğuliyyət üçün növbənöv oyun oynardılar.* H.Sarabski. **Axşamın dar çağı** – axşamüstü, günbatan zaman, qaş qaralan zaman**. Axşamın(ız) xeyir!** – axşamçağı bir-biri ilə görüşdükdə söylənilən təbrik sözü. **Axşam-sabah (səhər)** – bütün gün, aramsız, daim, həmişə. **Axşam-səhər** – həmişə, daim**. Günü axşam eləmək** – yubanmaq, günü boş keçirmək (başa vurmaq).

**AXŞAMÇAĞI** b a x **axşamüstü**. *Axşamçağı tarın səsi, Qarabağın şikəstəsi; Hər kəsin bir həmdəmi var.* M.Müşfiq. *Bir gün axşamçağı usta Ağabala evə gələndə arvadına dedi: – Ə, bilirsən nə var?* Çəmənzəminli. *Axşamçağı idi ki, kənd əhalisi işlərini qurtarıb arvadlar və kişilər ayrı-ayrı küçə ağzında .. çöməlmiş oturmuşdular.* B.Talıblı.

**AXŞAMKI** *sif.* Axşam vaxtı olmuş, axşam baş vermiş. *Polad bu axşamkı görüşün, danışdıqları sözlərin təsiri altında nələr düşünmürdü.* Ə.Vəliyev.

**AXŞAMQABAĞI** *zərf* Axşama yaxın, hava qaralmağa başlarkən.

**AXŞAMLAMA** "Axşamlamaq"dan *f.is.*

**AXŞAMLAMAQ** *f.* 1. Yol gedərkən bir yerdə gecələyib qalmaq, axşamı orada keçirmək. *Köçəri quş kimi hər yerə qoşar; Harda axşamlasa, orda da yaşar.* S.Vurğun.

2. Bütün gün, axşama qədər bir yerdə və ya bir işdə qalmaq.

3. Axşam olmaq, gün batmaq, hava qaralmaq.

◊ **Yaman yerdə axşamladıq!** – gözlənilməz halda çətin vəziyyətə düşməyi bildirən ifadə. [Səriyyə xala:] *Yaman yerdə axşamladıq, bala!* M.İbrahimov.

**AXŞAMLIQ** *is.* 1. Axşama məxsus, axşam görüləcək iş və s. *Axşamlıq heç bir işim qalmamışdır.*

2. "Bir" sözü ilə bərabər: **bir axşamlıq** – bir axşama (gecəyə) kifayət edəcək qədər. *Lampada bir axşamlıq neft qalıb. Bir axşamlıq kömür ola, ya olmaya. Bir axşamlıq işim qalıbdır.*

**AXŞAMOLDU** *is. mus.* Azərbaycan xalq musiqisində axşamın düşməsini vəsf edən təsnif formalarından biri.

**AXŞAMTƏRƏFİ** b a x **axşamüstü.**

**AXŞAMÜSTÜ** *zərf* Axşam vaxtı, günbatana yaxın, hava qaranlıqlaşan vaxt. *Axşamüstü gəzməyə çıxmaq. – O gün axşamüstü günəş üfüqə doğru əyilmiş, kölgələr uzanmağa başlamışdı.* S.Hüseyn. *Axşamüstü Bahadır kəndə hamıdan gec qayıtdı.* S.Rəhman. *Axşamüstü qoy uzaqdan; Havalansın xanın səsi; Qarabağın şikəstəsi.* S.Vurğun.

**AXTA** 1. *sif.* Erkəkliyi alınmış canlı. *Axta öküz. Axta qoç. Axta xoruz.* ☐ **Axta eləmək** – b a x **axtalamaq**.

2. *sif.* Tumu, çəyirdəyi çıxardılmış. *Axta gilas. Axta gavalı. – Xalq batıbdır noğula, şəkərə, qəndə; Bizim evdə axta zoğal da yoxdur.* M.P.Vaqif. // *is.* Tumu, çəyirdəyi çıxardılmış quru zoğal və s. *Məcməyinin içində bir nimçə plov, onun üstündə bir toyuq, toyuğun içində yağla qovrulmuş kişmiş, axta olardı.* H.Sarabski.

3. *is. məh.* Yəhər qaltağının üstünə çəkilən gön.

**AXTAÇI** *is.* At və başqa heyvanları axtalayan adam.

**AXTAXANA** *is. bot. məh.* Çayıra bənzər bir ot. *Axtaxana, dağda dana böyüdü; Mən böyük ollam haçana, bilmirəm.* M.Ə.Sabir.

**AXTALAMA** "Axtalamaq"dan *f.is.*

**AXTALAMAQ** *f.* 1. Axta eləmək; heyvanın, ya insanın erkəklik vəzilərini çıxartmaq; burmaq. *Dananı axtalamaq. Qoçu axtalamaq.* – [Müfid:] *Həkimlər və cərrahlar çağırdı, onların hamısı dedilər ki, bu iş ancaq körpəlik zamanında mümkündür. Hazırda bunları axtalamaq yazıqları məhv etmək deməkdir.* M.S.Ordubadi.

2. Meyvənin tumunu (çəyirdəyini) çıxartmaq. *Zoğal axtalamaq. – Birbəbir yadına sal cümlə unutduqlarını; Qış üçün axtalayıb yayda qurutduqlarını.* M.Ə.Sabir.

3. *məh.* Yəhərin qaltaq taxtasının üstünə gön çəkib tikmək. *Qaltaq axtalamaq.*

**AXTALANMA** "Axtalanmaq"dan *f.is.*

**AXTALANMAQ** *məch*. Axta edilmək, erkəklik vəziləri çıxardılmaq; burulmaq.

**AXTALANMIŞ** *f.sif.* 1. Axta edilmiş, erkəklik vəziləri çıxarılmış; burulmuş. *Axtalanmış qoç. Axtalanmış xoruz. Axtalanmış heyvan tez kökəlir.* – [Çapıq Əmrah:] *Cəmiyyət də insan kimidir. Axtalanmış adamdan kişi çıxmadığı kimi, axtalanmış cəmiyyətdən də kamil cəmiyyət ola bilməz!* İ.Şıxlı.

2. Tumu (çəyirdəyi) çıxarılmış. *Axtalanmış zoğal. Axtalanmış meyvə.* – *İxtiraçı alim armuddan tozcuqlar götürüb, üvəzin axtalanmış çiçəyinə köçürdükdə və ya əksinə etdikdə, mayalanma baş tutdu.* M.Axundov.

**AXTALATMA** "Axtalatmaq"dan *f.is.*

**AXTALATMAQ** *icb.* 1. Heyvanın və ya adamın erkəklik vəzilərini çıxartdırmaq; burdurmaq. *Atı axtalatmaq.*

2. Meyvənin tumunu (çəyirdəyini) çıxartdırmaq.

**AXTARILAN** *f.sif. riyaz*. Hesablama yolu ilə təyin edilməli olan. *Axtarılan kəmiyyət. Axtarılan ədəd.*

**AXTARILMA** "Axtarılmaq"dan *f.is.*

**AXTARILMAQ** "Axtarmaq"dan *məch. Alman komandanlığının əmrinə görə, bütün evlər, zirzəmilər axtarılırdı.* M.Hüseyn.

**AXTARIŞ** *is.* 1. Axtarma işi, kəşfiyyat. *Neft axtarışı dəstəsi.* // Bir şey, bir yol, bir çarə və s. arama. [Əli] *sabit fikrə malik deyildi. Daima axtarış yolunda, tərəddüd içində yaşayırdı.* Çəmənzəminli.

2. Cinayəti sübut edəcək əşyayi-dəlil tapmaq məqsədi ilə hökumət orqanları tərəfindən icra edilən axtarma, yoxlama işi; təftiş əməliyyatı. *Axtarış aparmaq. Başdan-başa axtarış.* – [Pristav dedi:] *Mən sabah onun* [Məhərrəmin] *mənzilində axtarış yapıb şübhəli vəsiqələri taparam və sonra sürgün etmək qolaydır.* H.Nəzərli. *Yəqin bu evdə axtarış gedirdi.* S.Rəhman. ☐ **Cinayət axtarış idarəsi** – cinayət axtarıb tapmaqla məşğul olan polis şöbəsi.

**AXTARIŞÇI** *is.* Bir şey axtaran, yeni üsul, yeni yol və s. axtaran. *Yazıçı, şair, dramaturq, tənqidçi axtarışçı olmalıdır*. S.Rəhimov.

**AXTARIŞMA** "Axtarışmaq"dan *f.is.*

**AXTARIŞMAQ** *f.* Hərtərəfli axtarmaq, aramaq, tapmağa çalışmaq. *Necə eyb axtarışırlar, necə gör yoldan azırlar, nə görürlərsə yazırlar.* M.Ə.Sabir.

**AXTARMA** "Axtarmaq"dan *f.is.*

**AXTARMAQ** *f.* 1. Gizli, yaxud gizlədilmiş və ya itmiş bir şeyi tapmağa, üzə çıxarmağa çalışmaq, aramaq. *Kitabı nə qədər axtardımsa, tapa bilmədim. Yerə düşmüş iynəni axtarmaq.* – *Axtaran tapar.* (Ata. sözü). // Görməyə, tapmağa çalışmaq. *Usta Ağabala qapını axtarınca divardakı şəkillərə də bir nəzər yetirdi.* Çəmənzəminli. *Hər kəs öz yerini axtarır, tapır və əyləşirdi.* S.Rəhimov. // Aramaq, tapmağa çalışmaq. *Məsmə, dərdlərini Tahirzadəyə danışmaq üçün vaxt, fürsət axtarırdı.* Mir Cəlal.

2. Əldə etməyə çalışmaq. *İş axtarmaq. Özünə otaq axtarmaq. Öz haqqını axtarmaq.* // Arzu etmək, bir şeyin olmasına, əmələ gəlməsinə, baş verməsinə çalışmaq. *Dava-dalaş axtarmaq.*

3. Yoxlamaq, araşdırmaq, müayinə etmək, təftiş etmək. *Ciblərini axtarmaq. Stolun yeşiklərini axtarmaq.* – *Ey müfəttiş! Yollanan kağızları axtarma çox.* M.Ə.Sabir.

4. Ummaq, gözləmək. *Onda nə ədəb axtarırsan. Bizdə elə şeylər axtarma.*

5. *məc*. Həddindən artıq fikir vermək. *Böyük işlərə fikir vermir, amma xırda şeyləri axtarır.*

**AXTARTMAQ** *icb.* Bir başqası vasitəsilə axtarmaq. [Şölə xanım:] *Xan səni axtardır ki, tutdursun, öldürsün.* M.F.Axundzadə.

**AX-TÜF** *is.* Tüpürmə, bəlğəm gətirmə.

**AX-UF** *is.* Heyifsilənmə, sızlama, inləmə; inilti. *Səttarzadə Gəldiyevin ax-ufunu, vurnuxduğunu gördü.* Mir Cəlal. *Yalıncaq ax-ufla heybəsini açıb, oradan .. bir ipək köynək çıxardı.* M.Rzaquluzadə. ☐ **Ax-uf eləmək** – sızlamaq, inləmək. *Göyçək bacı isə ax-uf eləməkdən qupquru qurumuşdu.* Ə.Vəliyev.

**AXUND** *is. din.* 1. İslamda dini rütbə.

2. Xüsusi təhsil görmüş din xadimi. *Ey milləti cəhalətə vadar edən axund; Hər dürlü fəqrü əczə giriftar edən axund!* M.Ə.Sabir. *Xalıq bir dəstə pul çıxarıb axundun ovcuna basdı.* S.Rəhimov.

**AXUNDLUQ** *is. din.* Axund sənəti, işi; mollalıq, ruhanilik. [Vaqif:] *Qəşəng şey*

*çoxdur, sənnən mənə yoxdur! Bu axundluqla keşişliyi boynumuza qoyub, dünyanı bizə haram eləyiblər.* Çəmənzəminli.

**AXUR** *is.* 1. Heyvanlara yem tökmək üçün taxtadan, daşdan və s.-dən qayırılan divara yapışıq qab, qutu. [Əmioğlu:] *Budaq baba, .. atı axura çək, rahat et, sonra uşaqlarınız ilə otağa buyurun, bizə qonaq olun.* S.S.Axundov. *Firidun söhbəti kəsib, yenə axurun üstündə oturdu.* M.İbrahimov. *Nadir axura arpa, saman töküb tövlənin o biri başında olan səkinin üstünə çıxdı.* B.Talıblı.

2. *məh.* İçində üzümü əzib, suyunu çıxarmaq üçün içərisi yonulub dərinləşdirilmiş tava daşı. *Baba isə üzümləri dərib gətirər, daş axura töküb, şalvarını dizinədək çırmalayır .. və şirə yığırdı.* H.Sarabski.

**AX-VAY** b a x **ah-vay**.

**AİD** *əd.* [*ər.*] Nisbəti və əlaqəsi olan, təəllüqü olan, məxsus. *İdarəyə aid işlər. Dilçiliyə aid terminlər. Məsələ bizə aid deyil. Şəkil 13-cü səhifəyə aiddir.* – [Nadir bəy:] *Məncə, gözəllik zövqə aid bir şeydir.* H.Cavid. □ **Aid olmaq** – nisbəti və əlaqəsi olmaq, məxsus olmaq, dəxli olmaq. *Bu məktub Bəhramın öz qəlbinə və taleyinə aid idi.* Ə.Vəliyev.

**AİDİYYƏT** *is.* [*ər.*] Aid olma, nisbət və əlaqəsi olma, dəxli olma. *Bunun sizə aidiyyəti varmı?* □ **Aidiyyəti üzrə** *rəs.* – haraya lazımsa, oraya, aid olduğu yerə. *Ərizəniz aidiyyəti üzrə göndərildi.*

**AİDLİK** b a x **aidiyyət.**

**AİLƏ** *is.* [*ər.*] 1. Ata-anadan, uşaqlardan, nəvələrdən və yaxın qohumlardan ibarət olub, bir yerdə yaşayan adamların hamısı; külfət. *Ailə başçısı. Ailə saxlamaq. Ailə üzvü. Ailə tərbiyəsi. Ailə həyatı. Ailə vəziyyəti.* – [Qətibə:] *Ailəmizə üz verən böyük və bədbəxt faciələri sizə bildirməyə məcbur oldum.* M.S.Ordubadi. *Atılmış zəhmətə on dörd yaşında; Bir böyük ailə vardı başında.* A.İldırım. *Ailənin başqa üzvləri də sakit və altdan-altdan gah Şəmsiyyəyə, gah Səlimiyə baxır..* M.İbrahimov. // *məc.* Çox mehriban. *Bir ailə kimi yaşamaq.*

2. *zool.* Bir erkəklə bir və ya bir neçə dişidən ibarət heyvan dəstəsi. *Arı ailəsi. Qarışqa ailəsi.*

3. *dilç.* Mənşəcə bir olan dillər qrupu. *Türk dilləri ailəsi.*

**AİLƏBAZ** *sif.* və *is.* [*ər.* ailə və *fars.* ...baz] Ümumi mənafeyi deyil, birinci növbədə öz qohum və yaxınlarının mənafeyini güdən (adam).

**AİLƏBAZLIQ** *is.* Ümumi mənafeyin ziddinə olaraq, ilk növbədə öz qohumlarının və yaxın adamlarının mənafeyini güdmə.

**AİLƏCANLI** *sif.* Öz ailəsini çox sevən, onun qeydinə qalan, ailəsinə yaxşı baxan. *Ailəcanlı kişi.* – [Müəllim:] *Qonşu, görürəm, siz doğrudan da əsil qayğıkeş, ailəcanlı bir yoldaşsınız.* Mir Cəlal. *Həmişə evcanlı, ailəcanlı; Kişilər xoş gəlir çox qadınlara...* M.Araz.

**AİLƏÇİLİK** *is. dan.* 1. B a x **ailəpərəstlik**.

2. *məc.* Bir işin öz mənfəətinə, xəlvəti və öz yaxın adamlarının məhdud çərçivəsi içərisində aparılması, həll edilməsi; qohumbazlıq, dostbazlıq (mənfi mənada işlənir). *İşdə ailəçiliyə yol verilməməlidir. Məsələni ailəçilik yolu ilə həll etmək olmaz.*

**AİLƏLİ** *sif.* Ailəsi olan, külfəti olan, arvad-uşağı olan; evli. *Ailəli adam.*

**AİLƏPƏRƏST** *sif.* [*ər.* ailə və *fars.* ...pərəst] 1. B a x **ailəcanlı.**

2. B a x **ailəbaz**. *Ailəpərəst adam.*

**AİLƏPƏRƏSTLİK** *is.* 1. Ailəsinə məhəbbət, ailəsini sevmə.

2. B a x **ailəbazlıq.**

**AİLƏSİZ** *sif.* Ailəsi, külfəti olmayan, arvad-uşağı olmayan, evli olmayan. *Evsiz, ailəsiz məhəbbətmi var?* S.Vurğun.

**AİLƏSİZLİK** *is.* Ailəsi, külfəti, arvad-uşağı olmama, ailəsiz adamın halı.

**AİLƏVİ** *sif.* [*ər.*] Ailəyə mənsub, ancaq ailəyə məxsus, ailəyə aid olan. *Ailəvi məsələ. Ailəvi söhbət. Ailəvi qonaqlıq.* – [Zübeydə xatun] *xəlifə ərinin azğın eyş-işrət məclislərində, əlbəttə ki, iştirak edə bilməzdi və .. o ərinin məhrəm, ailəvi məclislərindən də qaçınırdı.* Ə.Məmmədxanlı. // *Zərf mənasında. məc.* Səs-küysüz, xəlvəti; başqaların, yad adamların iştirakı və xəbəri olmadan. *Məsələni Əvəzlə birlikdə hay-küysüz, səssiz, ailəvi şəkildə həll etməyi qərara alandan sonra, ata düşünürdü.* Ə.Vəliyev.

**AJÁN** [*fr.*] Polis, polis agenti. *Nə zalım əmniyyədən, nə ajandan qorxdular.* S.Rüstəm. *Dustaq etmiş haqq deyən o insanı ajanlar.* M.Rahim. *Bir darvaza fənərini külək çırpır bayaqdan; Gəlir ajan atlarının nal səsləri uzaqdan.* Ə.Cəmil.

**AJÚR** *is.* 1. Deşikli hörgü.

2. İncə krujevalı (şəbəkəli, torlu) parça.

**AKADÉMİK** [*yun.*] 1. Elmlər Akademiyasının həqiqi üzvü.

2. Müvafiq akademiyaya seçilmiş alimin, rəssamın, heykəltəraşın və b.-nın fəxri adı.

**AKADEMİK**, *sif.* 1. Akademiyaya aid olan. *Akademik lüğət. Akademik kitabxana.*

2. Akademizm (2-ci mənada) ənənələrinə riayət etmə.

◊ **Akademik il** – tədris ili. **Akademik saat** – məktəbdə dərs, yaxud mühazirə üçün müəyyən edilmiş vaxt – 45-50 dəqiqə. **Akademik teatr** – yaradıcılıq cəhətdən nümunəvi sayılan teatr.

**AKADÉMİYA** [miladdan qabaq IV əsrdə Afina şəhəri yaxınlığındakı bağlarda qədim yunan filosofu Platon tərəfindən təşkil edilmiş məktəbin adından] 1. Elm və sənətləri inkişaf etdirmək məqsədini daşıyan ali elmi müəssisə. *Azərbaycan Milli Elmlər Akademiyası. Tibb Akademiyası.*

2. Bəzi xüsusi elm sahələrinə aid müxtəlif ali məktəblərin adı. *İctimai Elmlər Akademiyası. Hərbi Tibb Akademiyası.*

**AKADEMÍZM** [*yun.*] 1. Elm və tədris məşğələlərində sırf nəzəri cəhətə həddindən artıq fikir verilməsi, onların praktikadan, həyatın tələblərindən ayrılması.

2. Təsviri incəsənətdə: müəyyən klassik nümunələrə riayət etmək üçün ənənəvi qanunlar qoyan və incəsənətdə realizmə qarşı mübarizə aparan cərəyan.

**AKÁSİYA** *is.* [*yun.*] *bot.* Paxlalılar fəsiləsindən ağac və ya kol cinsi. *Ağ akasiya. Sarı akasiya. – Akasiya 5-6 m hündürlüyündə ağac olub xırda lələkli yarpaqları və sünbül şəklində yerləşmiş açıq-sarı rəngli və ətirli çiçəkləri vardır.* R.Əliyev. *Akasiya və yasəmən ağaclarının ətri küçələri doldurmuşdu.* Ə.Sadıq. *Camaat akasiya ağacının kölgəsində stullar qoyub səhər açılandan gecəyarısına qədər açıq havada çay içirdi.* İ.Məlikzadə.

**AKIN** *is.* [*qazax.*] Qazax və qırğızlarda xalq aşığı, ozan.

**AKKÓRD** *is.* [*ital.*] *mus.* Bir-birindən çeşidli intervalda yerləşən, eyni zaman ərzində ən azı üç həmahəng səslənən tonun birləşməsi. *Səbri bütün diqqətini toplayıb son akkordları vurdu.* M.Hüseyn.

**AKKORDEÓN** [*fr.*] Qarmona oxşaryan musiqi aləti. *Nəfəsli musiqi alətləri əsas etibarı ilə üç qrupa ayrılır: klavişli musiqi alətləri (ərğənun, qarmon, fisqarmoniya, bayan, akkordeon və sairə)...* Ə.Bədəlbəyli.

**AKKORDEONÇU** *is.* Akkordeon çalan çalğıçı.

**AKKREDİTÍV** [*fr.*] İdarə və ya şəxsə vermək üçün kredit; müəssisənin digər bir müəssisəyə göstəriş sənədi. *Akkreditiv ilə hər yerdə əmanət kassalarından pul almaq olar.*

**AKKUMULYÁSİYA** [*lat.*] *fiz.* Elektrik enerjisinin toplanması.

**AKKUMULYÁTOR** [*lat.*] *fiz.* Sonradan istifadə olunmaq məqsədi ilə elektrik enerjisi, yaxud istilik toplamaq üçün cihaz. *Elektrik akkumulyatoru. – Neft qazı akkumulyatora daxil olub, orada kondensatdan və zirzibildən təmizlənir.* Məmmədəliyev.

**AKMEÍZM** [*yun.*] 1912-1913-cü illərdə rus ədəbiyyatında meydana gəlmiş burjua-zadəgan cərəyanı.

**AKR** *is.* [*ing.*] *köhn.* Gündə bir cüt öküzlə şumlanan sahə. 1 akr = 4046,86 kv.m.

**AKRİXÍN** [*lat.*] *tib.* Kinəni əvəz edən malyariya dərmanı.

**AKROBÁT** [*yun.*] 1. Sirkdə akrobatik nömrələr göstərən artist; canbaz.

2. *idm.* Gimnastika ilə məşğul olan idmançı.

**AKROBATÍK** *sif.* Akrobatikaya aid. *Akrobatik nömrə.*

**AKROBÁTİKA** [*yun.*] Gimnastika və sirk sənətinin bir növü.

**AKROBATLIQ** *is.* Akrobatın işi, sənəti, məharəti; canbazlıq.

**AKRÓPOL** [*yun.*] Qədim yunan şəhərlərinin adətən təpə üzərində yerləşən möhkəmləndirilmiş hissəsi.

**AKSELBÁNT** [*alm.*] Bəzi ordularda: müxtəlif ştab zabitləri və adyutantların geyim üstündən çiyinlərindən keçirdikləri bəzəkli qaytanlar.

**AKSİÓM** [*yun.*] 1. *riyaz.* Sübutsuz qəbul edilən fikir. *Həndəsədə olduğu kimi, maddi nöqtənin dinamikası elmini qurmaq üçün bir neçə aksiom qəbul olunur. Bu aksiomlar həndəsədəki aksiomlar kimi, uzun müddət aparılan müşahidə və təcrübələrdən alınmışdır..* Xəlilov.

2. Ümumiyyətlə, dəlilə, sübuta ehtiyacı olmayan həqiqət. *Hökumətin mədəniyyət, elm tərəfdarı olduğu artıq Nəcmi müəllim üçün bir aksiom idi.* Ə.Əbülhəsən.

**AKSİONÉR** [*fr.*] b a x **səhmdar.**

**ÁKSİYA[1]** [*fr.*] *iq.* Səhm (aksioner şirkətin üzvlərinə verilən qiymətli kağız). *Aksiyaların birjada ucuzlaşdığını Aslan bəy öyrənmişdi.* A.Şaiq.

**AKSİYA[2]** *is.* [*lat.*] Müəyyən iqtisadi və ya siyasi məqsədlə hərəkat.

**AKSİZ** *is.* Verginin bir növü. *Aksiz markası.*

**AKT** *is.* [*lat.*] 1. Şahidlərin iştirakı ilə, yaxud yoxlama nəticəsində müəyyən edilən bir faktı təsdiq edən sənəd, yazı, protokol və s. *Akt tərtib etmək. Akta qol çəkmək. Notarial akt. – Qəhrəman görmüşdü ki, meşəbəyi Rüstəm üçün nə qədər akt bağlamışdı.* S.Rəhimov.

2. Dövləti və ya ictimai əhəmiyyəti olan fərman, qərar. *Torpağın həmişəlik istifadə üçün kəndlilərə verilməsi haqqında dövlət aktı.*

**AKTÍV[1]** [*lat.*] 1. Partiya təşkilatının və ya başqa ictimai təşkilatın ən fəal hissəsi. *Partiya aktivi. Həmkarlar ittifaqı aktivi.*

2. *Sif. mənasında.* Fəal. *Bizim dərnəyin aktiv üzvü.* // Güclü, təsirli. *Aktiv müqavimət.*

◊ **Aktiv lüğət (söz) ehtiyatı** *dilç.* – danışanın tamamilə başa düşdüyü və həmişə işlətdiyi sözlər. **Aktiv seçki hüququ** – seçmək hüququ.

**AKTÍV[2]** [*lat.*] *mal.* Mühasibatda: balansın, müəyyən tarixdə müəssisə, ya idarənin mövcud olan bütün qiymətli şeylərindən və ya borc tələblərindən ibarət olan hissəsi (*passiv* əksi).

**AKTİVLƏŞDİRİLMƏ** "Aktivləşdirilmək"dən *f.is.*

**AKTİVLƏŞDİRİLMƏK** *məch.* Fəallaşdırılmaq, fəaliyyəti artırılmaq (gücləndirilmək).

**AKTİVLƏŞDİRMƏ** "Aktivləşdirmək"dən *f.is.*

**AKTİVLƏŞDİRMƏK** *f.* Fəallaşdırmaq, fəaliyyətini artırmaq (gücləndirmək).

**AKTİVLƏŞMƏ** "Aktivləşmək"dən *f.is.*

**AKTİVLƏŞMƏK** *f.* Fəallaşmaq. [Məcid] *belə bir mətbəx qadınının birdən-birə Səriyyə kimi aktivləşə biləcəyini bilmirdi.* Mir Cəlal.

**AKTİVLİK** *is.* Fəallıq, fəaliyyət, çalışqanlıq. *Aktivlik göstərmək. İntibah siyasi aktivliklə, ədəbiyyat və xalq sənətinə dönüşlə başlayır.*

**AKTRÍSA** [*fr.*] Teatr tamaşalarında rol ifadə edən qadın artist. *Mayın doqquzunda böyük dram teatrında tamaşa bitdikdən sonra aktyor və aktrisalar qabağımıza çıxıb, bizi teatrın qonaq odasına dəvət etdilər.* C.Cabbarlı.

**AKTUÁL** *sif.* [*lat.*] Hal-hazır üçün ən mühüm, ən vacib olan; yetişmiş, həllini tələb edən. *Aktual məsələ. Aktual mövzu.*

**AKTUALLIQ** *is.* Hal-hazır üçün mühümlük, vaciblik. *Məsələnin aktuallığı.*

**AKTYÓR** [*fr.*] Teatr tamaşalarında rolları ifa edən sənətkar; artist. *Maskalar geymiş aktyorlar .. oyun çıxarıb adamları güldürürdülər.* S.S.Axundov. [Həyat:] *Sən temperamentli aktyorlar kimi lap özündən çıxdın ki!* M.İbrahimov. *Azərbaycan aktyorları burada arabir teatr tamaşaları verirdilər.* M.Hüseyn.

**AKTYORLUQ** *is.* Aktyorun, artistin sənəti, peşəsi. *Aktyorluq etmək. – Bu adamın* [Vəlinin] *çox böyük aktyorluq, rejissorluq, təşkilatçılıq istedadı vardı.* S.Rəhimov.

**AKULƏ** *is.* [*fars.*] İri dənəli düyü növü.

**AKUSTÍK** *sif.* Akustikaya aid olan. *Akustik cihazlar. Akustik titrəyiş.*

**AKÚSTİKA** [*yun.*] 1. Fizikanın səs bəhsi.

2. Binanın (məs.: teatr, kino salonunun və s.-nin) daxilində səsi əksetdirmə qabiliyyəti. // Bina içərisində musiqinin, nitqin və s. səsinin eşidilmə dərəcəsi.

**AKUŞKA** [*rus.*] *dan.* Pəncərə. [Fatma xanım:] *Mən dedim ki, a qız, akuşkanın ağzından belə dur..* N.Vəzirov. [İskəndər] *bir az fikir eləyəndən sonra, gedib yapışır Nazlının əlindən və gətirir akuşkanın qabağına.* C.Məmmədquluzadə.

**AKVARÉL** *is.* [*fr.*] *rəss.* 1. Su ilə qarışdırılmış rəng.

2. Bu rənglərlə işlənmiş rəssamlıq əsəri. *Rəssamın "Məcnun səhrada" adlı qara akvarelində, çöllərdə sərgərdan gəzən Məcnunun arıq bədənini yalnız iki heyvan – şir və ceyran əhatə etmişdir.* "İncəsənət".

**AKVARELÇİ** *is.* Sulu boya ilə şəkil çəkən rəssam.

**AKVÁRİUM** *is.* [*lat.*] 1. Su heyvanlarını və bitkilərini saxlamaq və çoxaltmaq üçün şüşə qab.

2. Tədqiqat və ya nümayiş etdirmək üçün su heyvanları və bitkiləri saxlanan müəssisə.

**AQ** [*ər.*] b a x **ağ⁴.**

**AQAVA** *is.* [*yun.*] *bot.* Qısa gövdəli bitki cinsi.

**AQİBƏT** *is.* [*ər.*] Son, axır, nəticə, nəhayət. [Piri baba:] *Ay dəliqanlılar, aqibətinizi çox pis görürəm.* S.S.Axundov. *Xəyalən hər ikisi gələcəyi, başladıqları işin aqibətini düşünürdü.* M.İbrahimov. // Ara söz mənasında. *Ey Nəbati, nə qədər var isə ömrün, xətt yaz; Aqibət, bir gün olur kim, gəli bir karə bu xətt.* Nəbati. // Zərf mənasında. Axırda, nəticədə. *Dərdinə bulunmaz oldu dərman; "Məcnun" dedi, verdi aqibət can.* Füzuli. *Gövhəri-əşkin kimi düşdün nəzərdən aqibət; Noldu, ey miskin könül, bir söylə təqsirin sənin?* S.Ə.Şirvani. *Çəksə hər kim ki bir qədər zəhmət; Olar, əlbəttə, aqibət rahət.* A.Səhhət.

◊ **Aqibətin(iz) xeyir! (xeyir olsun!)** – "sabahın (axşamın) xeyir!"ə cavab olaraq işlədilən ifadə. [Cavanşir:] *Aqibətiniz xeyir! Haradan belə, övladlarım?* M.Hüseyn.

**AQİBƏTLİ** *sif.* Müvəffəqiyyətlə nəticələnən, axırı yaxşı olan, uğurlu.

**AQİBƏTSİZ** *sif.* Axırı pis olan, sonu müvəffəqiyyətsiz, nəticəsiz. *Aqibətsiz iş.*

**AQİBƏTSİZLİK** *is.* Heç bir şeylə nəticələnməmə; müvəffəqiyyətsizlik, nəticəsizlik.

**AQİL** *sif.* [*ər.*] Ağıllı, müdrik, tədbirli. *Tutmazam zənciri-zülfü tərkin, ey naseh, məni; Xah bir aqil xəyal et, xah bir divanə tut.* Füzuli. *Yusif şah aqil adam idi.* M.F.Axundzadə. *İki aqil kəs eyləməz dəva; Eyləməz bir-birinə büğz əsla.* S.Ə.Şirvani. // İs. mənasında. *Yad eylə o bikəsi düşəndə; Divanəsini unutmaz aqil.* Q.Zakir. *Aqil gərək cəmi ləzzəti-dünyəviyyədən bəhrə aparsın.* M.F.Axundzadə. *Nə bilsin olmayan Məcnun ki, Leyli kimdir, ey aqil!* Ə.Nəzmi.

**AQİLANƏ** *sif.* və *zərf* [*ər.* aqil və *fars.* ...anə] *köhn.* Ağıllı, ağıla müvafiq, ağıllı adama layiq. *Aqilanə hərəkət. Aqilanə söz.* – [Şah:] *Çox aqilanə iş görür, həm öz canını qurtarır, həm camaatın canını.* Ə.Haqverdiyev.

**AQNÓSTİK** [*yun.*] *fəls.* Aqnostisizm tərəfdarı.

**AQNOSTİSÍZM** [*yun.*] *fəls.* Dünyanı dərk etməyin mümkün olmadığını, insan ağlının məhdud olub, duyğular xaricində heç bir şeyi dərk edə bilmədiyini iddia edən fəlsəfi nəzəriyyə.

**AQRÁR** *sif.* [*lat.*] 1. Torpağa aid olan. *Aqrar məsələ. Aqrar islahatı.*

2. Kənd təsərrüfatının sənayedən yüksək olması ilə səciyyələnən. *Aqrar ölkə.*

**AQRÁRİ** [*lat.*] 1. İri torpaq sahibi, mülkədar.

2. Cəm şəklində: AQRARİLƏR – xarici ölkələrdə iri zadəgan, qolçomaq, torpaq mülkiyyətini müdafiə edən bir sıra partiyaların üzvlərinə verilən ad.

**AQREQÁT¹** [*lat.*] *tex.* Ümumi bir işi görmək üçün bir-birinə birləşdirilmiş bir neçə müxtəlif tipli maşından, qurğudan ibarət mürəkkəb maşın. *Əlibala Bəşirlinin aqreqat və maşın hissələri ilə necə rəftar etdiyini görüncə Muradın sevincdən gözləri yaşardı.* Ə.Vəliyev. *Bu şəhərdə dizellərin, aqreqatların, zavod fitlərinin səs-küyü həmişə eşidilir.* Mir Cəlal. // Bir maşının mürəkkəb hissəsi.

**AQREQÁT²** *is.* [*lat.*] Maddənin üç halının – bərk, duru və qaz hallarının ümumi adı.

**AQREQATÇI** *is. xüs.* Aqreqatda işləyən, aqreqatı idarə edən fəhlə.

**aqro...** [*yun.*] Mürəkkəb sözlərdə: sözün əkinçiliyə, torpağa aid olduğunu göstərən ixtisar, məs.: aqrotexnik, aqrominimum və s.

**AQROBİOLÓGİYA** [*yun.*] Əkinçiliyə, bitkiçiliyə və heyvandarlığa təsir edən ümumi bioloji qanunauyğunluqlar haqqında elm. *Aqrobiologiya elmi.*

**AQROBİOLOJÍ** *sif.* Aqrobiologiyaya aid olan.

**AQROKİMYA** *is.* [*yun.* aqro və *ər.* kimya] Bitkilərin qidalanmasından, gübrələr tətbi-

qindən və bitkilərin kimyəvi yollarla qorunma üsullarından bəhs edən elm.

**AQROKİMYƏVİ** *sif.* Aqrokimyaya aid olan.

**AQROMƏNTƏQƏ** *is.* [*yun.* aqro və *ər.* məntəqə] *k.t.* Aqronomluq məntəqəsi. *Lətif Cəmilə deyirdi: – Məktəb yerini şumlayın, aqroməntəqəni təmizləyin, arxları təmizləyin.* Mir Cəlal.

**AQROMÍNİMUM** [*yun.* aqro və *lat.* minimum] Kənd təsərrüfatı sahəsində ən zəruri tədbirlərin və biliklərin məcmusu. *Aqrominimumun əsas məsələlərindən biri ziyanverici həşərat və alaq otları ilə mübarizədir.*

**AQRONÓM** [*yun.*] Kənd təsərrüfatı (aqronomiya) mütəxəssisi.

**AQRONOMÍK** *sif.* Aqronomiyaya aid olan. *Aqronomik üsullar. Aqronomik tədbirlər. – Qorxmazın aqronomik qaydalarını Abbas kişi sadə sözlərlə izah edirdi.* Ə.Vəliyev.

**AQRONÓMİYA** [*yun.*] Kənd təsərrüfatı və əkinçilik haqqında elm.

**AQRONOMLUQ** 1. *is.* Aqronom sənəti, aqronomun işi. *Aqronomluq maraqlı işdir. – Kosaoğlu çox danışdı. Axırda təklif etdi ki, İmranı aqronomluqdan çıxartmaq lazımdır.* İ.Şıxlı. *Əmirxanı qayəsizlik yerdən qopardı; Aqronomluq sənətinə getmədi daha.* S.Vurğun.

2. *sif.* Aqronomiyaya aid olan. *Aqronomluq məktəbi. Aqronomluq məntəqəsi.*

**AQROŞƏHƏR** *is.* [*yun.* aqro və *fars.* şəhr] Sovet dövründə kolxozçuların yaratdığı şəhər tipli qəsəbə.

**AQROTÉXNİKA** [*yun.*] Kənd təsərrüfatı bitkilərini becərmə üsulları. *Yüksək aqrotexnika bol məhsul götürmənin rəhnidir. – Aqrotexnika qaydalarına düzgün əməl edildikdə, qarğıdalı əkini sahəsinin hər hektarından 500-800 sentner yaşıl kütlə və xeyli çox dən götürmək mümkündür.*

**AQROTEXNİKİ** *sif.* Aqrotexnikaya aid olan. *Məhsuldarlığı artırmaq üçün aqrotexniki biliyi artırmaq tələb olunur.* – [Əsədov:] *..Allahın beş traktorunu ala bilmir, yeni üsuldan, aqrotexniki qaydada becərmədən danışır.* İ.Şıxlı.

**AL[1]** 1. *sif.* Qırmızı. *Al bayraq. Al qan. Al şəfəq. – Al yanaqların sanasan ki, qızılgül xərməni; Tər zənəxdaninə baxdıqca cünun eylər məni.* M.P.Vaqif. *Sənə al don yaraşır, niyə qarə geymisən sən; Məgər aşiqin ölübdür, sənə bu əza neçindir?* S.Ə.Şirvani. *Zümrüd göydə günəş yandı; Al şəfəqə yer boyandı.* S.Vurğun. // *is.* Qırmızı paltar, al parça. *Saqqalı ağ olanın qiymətidir bir qara pul; Gər girsən bəzənib gündə yaşıl, al içinə.* M.P.Vaqif. *Qərq olsun yaşıla, ala sərasər; Naz ilə sallana-sallana gəlsin!* Q.Zakir. [Qəribin anası:] *Gəlişin haradan, bazirganbaşı?; Sən alıb-satırsan alı, qumaşı.* "Aşıq Qərib". ◻ **Al geymək** *məc.* – bəzənmək, qızarmaq. *Al geyib qızarır yenə üfüqlər; Bir azdan gözünü açacaq səhər.* S.Vurğun. *Kəndimiz bəzənib süsən, sünbülə; Bağlar geyib al, başına döndüyüm.* (Qoşma).

2. Qızmar, yandırıcı. *Gecələr ayazda, gündüzlər al gün altında gəmi muzdurunun zəhməti hər bir zəhmətdən fövqdür.* S.M.Qənizadə.

3. *is. köhn.* Qadınların üzlərinə, dodaqlarına sürtdükləri qırmızı boya, ənlik.

**AL[2]** *is. köhn.* Hiylə, məkr, yalan. *Aldandılar, aldanmadıq dünyəvi məkrü alına.* Nəsimi. *Onun hər muyunda yüz min qal oldu; Qaşı fitnə, qəmzəsində al oldu.* Qurbani. *Canım aldın mey üçün, saqi, içirdin mənə qan; Dad əlindən ki, məni al ilə məğbun etdin.* Füzuli.

◊ **Al dil** – hiylə, məkr, aldatma, yalan. [Səmayə] *özü bir yaxşı ictimaiyyətçi qızdı; Heydərov onu al dillə aldadıb yoldan çıxartmışdır.* Mir Cəlal. **Al dilə tutmaq** – aldatmaq, tovlamaq, hiylə işlətmək. [Ələmdar:] *..Bəy məni al dilə tutub bu dörd divarın arasına gətirib..* S.Rəhimov. **Ala düşmək** – şərə düşmək, kələyə düşmək, tora düşmək.

**AL[3]** *is.* Xurafata inananların təsəvvüründə: qaranlıqda tək qaldıqda guya insanın gözünə görünən mövhum surət, xəyal; qulyabanı (bəzən "al anası" şəklində işlənir). *Ata, ata, süpürgəsaqqal gəlir; Ərdo Məlik gəlir, odur al gəlir.* A.Səhhət. *Zahıya deyərdilər ki, yatma, yatsan, al anası gələr, ciyərini çıxarar.* H.Sarabski.

**ALA[1]** 1. *sif.* Qarışıq rəngli, tükünün bir hissəsi ağ, o biri hissəsi başqa rəngdə olan. *Ala at. Ala inək. Ala öküz. – Bu gün onlar xaldar yabıya və ala cöngəyə dərz çatıb*

*daşıyırdılar.* S.Rəhimov. // Ala-bula. *İlan vuran ala çatıdan qorxar.* (Ata. sözü) □ **Ala gözlər** – şəhla gözlər, açıq-mavi gözlər. *Xumar-xumar baxan ala gözlərin; Gərəkdir verəsən can qabağında.* M.P.Vaqif. *Of! Məni titrətdi sənin gözlərin; Göz yaşı görməsin ala gözlərin.* S.Vurğun. [Məryəmin] *də gözləri iridir, bunun da; onun da gözləri aladır*. B.Talıblı.

2. *is*. Taxıl zəmisi və ya şum suvarıldıqda, su basmayıb quru qalan yer, ləkə; alaca.

**ALA²** *is. dan.* Qanın pozulması nəticəsində dəridə əmələ gələn ağ ləkə (dəri xəstəliyi). // Xal, ləkə. □ **Ala düşmək** – xal düşmək, ağ ləkə düşmək.

**ALA³** *is. məh.* 1. B a x **alaq**.

2. Yeməli göyərti.

**ala...** Bir sıra mürəkkəb sözlərin əvvəlində sözün ifadə etdiyi şeydə alalıq, rəngbərənglik, ala-bulalıq, ağ rəng ilə qarışıqlıq, yaxud yarımçılıq, qeyri-müəyyənlik, dağınıqlıq, adda-buddalıq, natamamlıq və s. bu kimi xassələr olduğunu bildirir.

**ALA-BABAT** *sif.* və *zərf dan.* Nə yaxşı, nə pis; orta, babat, birtəhər. *Ala-babat palto. Çəpəri ala-babat düzəltmək.* // Başdansovma. *Ala-babat iş.* – [Tapdıq] *şəkilləri də ala-babat çəkib qurtardı.* Ə.Vəliyev.

**ALA-BABATLIQ** *is*. Ala-babat şeyin halı.

**ALABAXTA** *is. zool.* Meşə göyərçini**.** *Qəhrəman naxırçı yoldaşları ilə birlikdə meşələrdən dələyən yuvasını çıxarır, evdə bir cüt alabaxta balası saxlayırdı.* S.Rəhimov.

**ALABALIQ** *is. zool.* b a x **qızılxallı.**

**ALABANÇI** *məh.* b a x **alamançı**.

**ALABANÇILIQ** *məh.* b a x **alamançılıq.**

**ALABAŞ** *is*. İt adı. *Bildi hardansa bunların sorağın; Alabaş kəsdi dəstənin qabağın.* A.Səhhət. [Əlibəndənin] *..qəbrinin üstündə bir alabaş köpək bağlanmışdır ki, meyiti aparıb yandırmasınlar.* H.Sarabski.

**ALABAYDAQ** *is. məh.* Camaat arasında pis cəhətdən məşhur olmuş, pis ad qazanmış, rüsvay olmuş adam. □ **Alabaydaq etmək** – aləmə yaymaq, rüsvay etmək.

**ALA-BƏZƏK** *sif.* 1. Müxtəlif rənglərdən ibarət, rəngbərəng, ala-bula. *Ala-bəzək parça. Ala-bəzək qutu. Ala-bəzək xalça. Ala-bəzək xoruz. – Bir dəfə bağda ala-bəzək bir qurdu yarpağa büküb gətirdim.* S.S.Axundov. [Ceyran] *xalasının da nəzərini ala-bəzək şəkillərə cəlb etmək istəyirmiş kimi bu vərəqləri çevirməyə tələsmədi.* Ə.Əbülhəsən. □ **Ala-bəzək bənövşə** – çiçəklərinin böyüklüyü və əlvanlığı ilə adi bənövşədən fərqlənən becərilən gül bitki.

2. *məc.* Çox şit və bir-birini tutmayan rənglərdə olan. *Ala-bəzək paltar. Ala-bəzək tuman. Ala-bəzək köynək.*

**ALA-BƏZƏKLİK** *is.* Alabəzək şeyin halı, alabulalıq.

**ALABƏZGƏK** b a x **bəzgək.**

**ALA-BİŞMİŞ** *sif.* Yarıbişmiş, ala-çiy, lazımınca bişməmiş. *Ala-bişmiş ət.*

**ALABUĞA** *is. zool.* Qanadı pərdəli bir cücü.

**ALA-BULA** *sif.* Rəngbərəng xallardan, zolaqlardan ibarət, cürbəcür rənglərə boyanmış, müxtəlif rəngli. *Ala-bula pişik. Ala-bula tula. – Ağaclar ala-bula rəng alırdı.* M.Hüseyn. *Bu gün Kosa təmizlik işində irəliyə gedib dəsmalı ilə mürəkkəb qablarını, yoğun qırmızı karandaşları və ala-bula qələmləri təmizləyirdi.* S.Rəhimov. □ **Ala-bula çalmaq** – rəngləri düzgün olmamaq, müxtəlif rənglərdə görünmək. **Gözləri ala-bula çalmaq** – 1) şeylərin rənglərini seçə bilməmək; 2) məstlik və ya üzgünlük halında laqeyd surətdə o yan-bu yana baxmaq.

**ALA-BULALIQ** *is.* Ala-bula şeyin halı, ala-bəzəklik.

**ALA-BULANIQ** 1. *sif.* Yarıbulanıq, bir yeri bulanıq, bir yeri duru.

2. *zərf* Ala-bula. *Ala-bulanıq görmək.*

**ALACA¹** b a x **ala¹** 2-ci mənada.

**ALACA²** b a x **ala-bula.** [Dilbər:] *..Gündə 3-4 manat faytona verəndə özünü itirir, elə bil, mən də onun üçün çitalaca geyəcəkdim.* C.Cabbarlı.

**ALACAQ** *is.* Alınacaq borc, birinə çatacaq pul, tələb. *Alacağı verəcəyindən çoxdur. – Üçdə alacağı yox, beşdə verəcəyi.* (Məsəl). *Hələlik Culfada müxtəsər bir alacağım var, onun üçün gedirəm.* M.S.Ordubadi.

**ALACAQANAD** *is. zool.* Oxuyan kiçik meşə quşu.

**ALACAQLI** *is.* və *sif.* Başqasından alacağı, tələbi olan. *Alacaqlı ikən, verəcəkli olduq*. (Məsəl).

**ALACAQ-VERƏCƏK** *is.* Bir adamın, idarənin və s.-nin başqasından alacağı və ya başqasına borclu olduğu pul.

**ALACALANMA** "Alacalanmaq"dan *f.is.*

**ALACALANMAQ** *f.* Ala-bula rəng almaq, ala-bula olmaq, rəngarəng olmaq. ☐ **Gözü alacalanmaq** – gözü pər-pər çalmaq, ala-bula görmək. *Bu nədir? Yerdə də mahtabmı yanır; Yoxsa gözlərimmi alacalanır?* S.Vurğun. *Verdiyevin gözü alacalandı, dili söz tutmadı.* Mir Cəlal. *Bayram ayağa durub qapıya tərəf getmək istədi. Başı hərlənib gözləri alacalandı.* M.Hüseyn.

**ALACALI** *sif. dan.* Rəngbərəng, ala-bula.

**ALACALIQ** *is.* Ala-bulalıq.

**ALACƏHRƏ**[1] *is. zool.* Kolluqlarda yaşayan cücülərlə qidalanan sərçə fəsiləsindən bir quş. [Bibimgilin] *bağında, gözümə ağac deşiyində qayrılmış bir alacəhrə yuvası sataşdı.* S.S.Axundov.

**ALACƏHRƏ**[2] *is. bot.* Dağlıq yerlərdə bitən qabığı zolaq-zolaq ağac.

**ALA-ÇALPOV** *is.* 1. Yağış ilə bir yerdə yağan qar, küləkli qar; fırtına, çovğun (adətən mart ayında olur). *Ala-çalpov qar yağırdı.* Ə.Vəliyev.

2. Qışın kiçik çillədən sonra gələn və martın ortalarına düşən hissəsi.

**ALA-ÇARPAZ** b a x **çarpaz.**

**ALAÇI** b a x **alaqçı.**

**ALAÇIQ** *is.* Çubuqdan qurulub üstü keçə ilə örtülən köçəri mənzili; çadır. [Bayram:] *..Gecə vaxtı qorxudan alaçığın çətinindən başımı dışarı çıxara bilmənəm.* M.F.Axundzadə. *Bizi keçədən qayrılmış bir alaçığa gətirdilər..* A.Şaiq. *Bahar fəsli maldar kəndlilər buraya köçüb alaçıqlar qurarlar və .. mallarını otladarlar.* S.S.Axundov.

**ALA-ÇİY** *sif.* Yarımçıq bişmiş, yarıçiy (ət və s.). *Ala-çiy* (z.) *bişən əti adamlar tüstülü-tüstülü, alovlu-alovlu qapış-qupuş elədilər.* S.Rəhimov.

**ALADAĞ** *sif. dan.* Yanıq bişirilmiş (çörək və s.).

**ALA-DƏYMİŞ** *sif.* Yarımkal, yarımdəymiş (meyvə).

**ALADODAQ** *sif. məh.* Dodağının rəngi ağ, bədəninin rəngi isə başqa olan (at haqqında).

**ALAF** *is.* Heyvan yemi (ot, saman, küləş və s.). *Atlara alaf vermək. Alaf tədarükü. Alaf anbarı. Heyvanları qış üçün alafla təmin etmək. – Murad öküzlərin yerinə, alafına baxıb qayıdanda günəş Çiçəkli kəndini tamam bürümüşdü.* Ə.Vəliyev.

**ALAFA** *is. məh.* Böyük, nazik baş örtüyü. *Üfüqlərdə günəş güldüyü zaman; Üstünə bəzəkli yumşaq taftadan; Alafa çəkərdi, nazlardı səni.* R.Rza.

**ALAFİRƏNGİ** b a x **alafranqa**.

**ALAFLAMA** "Alaflamaq"dan *f.is.*

**ALAFLAMAQ** *f. dan.* Heyvana alaf vermək, yem vermək.

**ALAFRANQÁ** [*fr.*] Əsil mənası "fransız fasonunda" olub, ümumiyyətlə "avropasayağı, Avropa dəb və qaydasında" deməkdir. [Xədicənin] *başında açıq rəngli ipək çadrası, onun altında alafranqa əlbisəsi nəzərdiqqəti cəlb edirdi.* S.Hüseyn.

**ALAGÖL** *is.* Adda-budda göllər olan yer.

**ALAGÖZ(LÜ)** *sif.* İri açıq-mavi gözlü. *Alagöz oğlan. Alagöz qız. – Kirpiginin əsiriyəm şol alagözlü fitnənin.* Nəsimi. *Darvaza açıldı; içəri alagözlü, sarı, qısa saqqallı, geniş kürəkli .. bir adam girdi.* Çəmənzəminli. *Alagöz bir mələk gördüm, vuruldum.* H.Cavid.

**ALAGÜLLÜK** *is. zool.* Rəngi ala-bula uzunsov bir cücü.

**ALAĞAC** *is. dan.* 1. Sərhədlərdə basdırılan nişan ağacı.

2. Məsafəni göstərmək üçün yol kənarlarında basdırılan ağac.

**ALAHI** *sif.* [*ər.*] *dan.* Ayrı, başqa, digər, əlahiddə. [İçərişəhərli:] *Hər dəfə ki, mənim köpəyim bir alahı köpəyi boğurdu, elə bilirdim ki, on buruğum birdən fantan verirdi.* Ə.Haqverdiyev.

**ALAX-BULAX** *sif. məh.* Sözünün üstündə durmayan, fikrini tez-tez dəyişən. *Alax-bulax adam.*

**ALAKEŞ**[1] *is.* Alaq otlarını kəsmək üçün alət. *Kəndli qadın əlində alakeş, kürək, toxa gəlirdi.* Mir Cəlal.

**ALAKEŞ**[2] *sif. məh.* Qarnının altı ala olan heyvan. *Alakeş inək.*

**ALAKÖLGƏ** *is.* Həm kölgə, həm işıq, həm kölgəli, həm işıq olan yer.

**ALAKÜLÜNG** *is. bot.* Əkin yerlərində və çöllərdə bitən çiçəkli bitki. *Alakülüng cinsi .. üzəri sadə və ya vəzili tüklərlə örtülü birillik və ya çoxillik bitkilərdəndir.* M.Qədirov.

**ALAQ** *is.* Tarlada, bostanda və s.-də bitən və becərilən bitkilərin inkişafına mane olan yabanı bitki. *Alaq otları. Alaq basmaq. Alaq vurmaq. Alaq etmək. – Yasəmən ancaq alaq otlarının boynunu vururdu, kökü isə yenə torpaqda qalırdı.* Ə.Vəliyev. *Tez-gec o cığırı tamamilə alaq basacaqdır.* Ə.Məmmədxanlı. *Cərgə pambığından alaq vurulsun; Misir mahlıcından qalaq vurulsun.* R.Rza.

**ALAQANAD** *is. zool.* Ağaclıqlarda yaşayan ala-bəzək quş.

**ALAQANQAL** *is. bot.* Ağ ləkəli yarpaqları olan tikanlı alaq otu.

**ALAQAPI** *is.* 1. Evlərin böyük küçə qapısı; darvaza.

2. Tarixi bir hadisəni qeyd etmək üçün şəhərin və s.-nin girəcəyində tikilən qapı, tağ. *Alaqapısında "Mingəçevir" yazılmış şəhərə girəndə Umud maşının pəncərəsindən döyükə-döyükə gah sağa, gah sola baxdı.* İ.Məlikzadə. [Rejissor:] *Onu deyirəm ki, teatrın dekor materiallarından alaqapı çıxmaz.* M.Hüseyn.

**ALAQARANLIQ** *sif.* 1. Bir az qaranlıq, yarıişıq, yarıqaranlıq. *Onu* [Tanyanı] *həbsxananın qalın divarları, alaqaranlıq koridorları sıxır,* [o] *qaçıb qurtulmağa çarələr düşünürdü.* A.Şaiq. *Qəza icraiyyə komitəsi dəftərxanasında ən dibdəki alaqaranlıq otağa girsəydiniz, bir neçə dolab və bir masa ilə bir kürsü görərdiniz.* H.Nəzərli.

2. Səhər çağı, sübh gün çıxmaq üzrə olanda, dan yeri sökülən vaxt. *Hava alaqaranlıq ikən biz kəndə girdik. Kənd təzətəzə oyanırdı.* S.Rəhimov. *Cahandar ağa başa düşdü ki, pristav onu alaqaranlıqda boş-boşuna yanına çağırmır.* İ.Şıxlı. [Qəhrəman] *atası ilə birlikdə səhər ala-qaranlıqdan* (z.) *dükana gedər, axşam gün batandan sonra evə qayıdardı.* M.İbrahimov.

**ALAQARĞA** *is. zool.* Döşü boz rəngli qarğa.

**ALAQARIN** *sif. və zərf* Yarıtox; nə ac, nə tox.

**ALA-QARSAQ** *sif. dan.* Yaxşı bişməmiş (çörək, ət və s.).

**ALAQÇI** *is.* Alaq vuran, alaq edən. *Alaqçılar briqadası. Alaqçılar tezdən işə çıxdılar.*

**ALAQÇILIQ** *is.* Alaqçının işi, alaq vurma işi.

**ALAQÇİN** *is.* Alaq vurmaq üçün alət.

**ALAQDƏRƏN** b a x **alakeş**[1].

**ALAQLAMA** "Alaqlamaq"dan *f.is.*

**ALAQLAMAQ** *f.* Alağını vurmaq, alağını təmizləmək.

**ALAQLANMA** "Alaqlanmaq"dan *f.is.*

**ALAQLANMAQ** *məch.* Alağı vurulmaq, alağı təmizlənmək.

**ALAQLI** *sif.* Alaq basmış, alaq qarışmış (ot və s.). *Alaqlı əkin. Alaqlı ot.*

**ALAQLIQ** *is.* Alağı çox olan, alaq basmış yer.

**ALA-QOLAY** *zərf* Ala-babat, yüngülvari, azca. *Bu ala öküzə bir tay tapsaydıq, .. işimiz bir ala-qolay babatlaşardı.* S.Rəhimov.

**ALA-QOLAYLIQ** *is.* Ala-babatlıq.

**ALA-QORA** *sif.* Ala-dəymiş, ala-yetişmiş: lazımınca dəyməmiş, şirinləşməmiş. *Ala-qora üzüm. – Üzümlər gülünü tökərtökməz,* [onları] *ala-qora vaxtında yoluşdurub aparırdılar.* Mir Cəlal.

**ALALANMA** "Alalanmaq"dan *f.is.*

**ALALANMAQ** *f.* 1. İri açılmaq (gözlər haqqında). *Yenə can almağa xəyalınmı var? Məstana gözlərin alalanıbdır.* M.P.Vaqif.

2. Dən düşmək. *Feyzullanın da saqqalı alalanıbdır.* Q.Zakir.

**ALALI** *sif.* Alası olan, ala-bula xalları olan.

**ALAM** *is.* [*ər.* "ələm" söz. cəmi] Qəm, kədər, iztirab. *Qəm yemə, təxfif ver alamına; Az çəkər, heykəl yaparlar namına.* A.Səhhət. *Hər kəs öz alamına bir şivə ilə növhəsaz; Sevgili quşlar! Qılın dəsti-cəfadan etizaz.* M.Hadi.

**ALAMAN** *is. məh. köhn.* Çapqın, soyğun, talan.

**ALAMANÇI** *is. məh. köhn.* Quldur, qaçaq, yolkəsən, soyğunçu, talançı.

**ALAMANÇILIQ** *is. məh.* Quldurluq, qaçaqlıq, yolkəsmə, soyğunçuluq, talançılıq.

**ALAMƏZHƏB** *sif. dan.* Əqidə və məsləkində sabit olmayan və ya müəyyən məs-

ləki, əqidəsi, məfkurəsi olmayan. *Alaməzhəb adam.*

**ALANA** *is.* İçərisi şəkərli qozla doldurulmuş meyvə qurusu (armud, qaysı, şaftalı). *Məni boşlayıb, Məşədi Rəhim cəld qaçdı dükanın mətaından əvvəl bir neçə alana gətirdi.* C.Məmmədquluzadə.

**ALA-NƏM** *sif.* və *zərf* Bir qədər nəm, lazımınca qurumamış. *Dəriləri yuyub qurutduqdan sonra,* [onları] *ala-nəm yığdıq, tay bir az da ağırlaşdı.* H.Sarabski.

**ALANI** b a x **alana.**

**ALANQU** *is. məh.* Balaca alovlu ocaq, balaca tonqal.

**ALAPAÇA** *is.* Paçasının arası ağ olan kəhər və ya kürən at. *Bir atı var alapaça; Mənzil vermir, Qırat qaça.* "Koroğlu".

**ALAPARS** *is. zool.* Mışovul növündən olub, ağacda yuva tikib yaşayan bir heyvan.

**ALAPƏLƏNG(İ)** *sif.* Xallı, butalı, güllü, üzərində iri butalar olan çit, yaylıq, dəsmal və s. // Rəngləri bir-birinə uymayan, alabəzək. *Bir də görürsən geyib alapələngi köynək.* R.Rza.

**ALAPISRAQ** *is.* Ot içində bitən göbələk.

**ALA-PÖRTÜ** b a x **ala-çiy.**

**ALA-SEYRƏK** *sif.* və *zərf* Seyrək, dağınıq, orada-burada. *Meşə kimi görünən mədənlərdə ala-seyrək işıqlar yanır.* S.Rəhimov. *Dəniz buruqları hələ tək-təkdir; Gecələr işıq da ala-seyrəkdir.* S.Vurğun.

**ALA-SÜTÜL** *sif.* 1. Lazımınca yetişməmiş, dəyməmiş; bir qədər kal. *Buğdanı ala-sütül* (z.) *biçmək.*

2. B a x **ala-bişmiş.**

**ALAŞ** *is.* b a x **ala**[1] 1-ci mənada.

**ALAŞA** *is.* Arıq at; yabı. [Qardaşı:] [Sadıq kişi], *hazırlaş, alaşan haradadır? Uşaqlara de ki, tutub gətirsinlər.* M.Hüseyn.

**ALAŞIQ-DOLAŞIQ** *sif.* Aydın görünməyən, yaxşı seçilməyən.

**ALA-TALA** *sif.* Tala-tala, adda-budda, orada-burada. *Üfüqlərə yatmış ala-tala buludlar pul kimi qızarmış ocaq daşlarını xatırladırdı.* M.İbrahimov. *May ayı idi! Havalar bir az qızmışdısa da, ancaq hələ dərələrdə, dağların döşündə ala-tala qar qalmışdı.* R.Rza.

**ALA-TORAN** b a x **ala-qaranlıq.** *Sabahın ala-toranı yerə çökmüş, yasavulun pəncərəsinin qabağını pərdə kimi örtmüşdü.* S.Rəhimov. *Ala-torandan qalxıb hara gedəsən? – deyə* [Əlyarov] *gözlərini ovuşdurdu.* M.Hüseyn. *Bir az da yadırğadığı qələmi barmaqları arasında bərk sıxaraq, sərin şimal axşamının ala-toran işığında yazırdı.* Mir Cəlal.

**ALA-TORANLIQ** b a x **ala-qaranlıq.** *İshaq kişinin arvadı səhər tezdən ala-toranlıq qayğanaq bişirib gətirdi.* M.Hüseyn. *Saat yeddini vurur, göylər ala-toranlıq.* M.Seyidzadə.

**ALAY** *is.* 1. Camaat, kütlə, böyük dəstə, izdiham, çoxlu miqdarda adam. *Çinardan tökülən sarı yarpaqlar, yavaş-yavaş irəliləyən bir cənazə alayının ayaqları altında .. xışıltı ilə səslənirdi.* H.Nəzərli. *Zeynal matəm alayını təqib edənlərə məxsus məyus addımlarla sahil boyu ilə evə qayıdırdı.* S.Hüseyn.

2. Diviziya tərkibinə daxil olan müstəqil qoşun vahidi; polk. *On altıncı Minqrel alayının bir rotası və yüz nəfər kazak Bakıya gətirilmişdir.* M.S.Ordubadi. *Topçular alayı gəlir arxadan; Fırlanır dolaşıq təkər səsləri.* S.Vurğun. *Diviziyanın alayları, hər alayın bölükləri kənd aralarında, meşəliklərdə, dağda-daşda yerləşmişdi.* S.Rəhimov.

**alay-alay** *zərf* Dəstə-dəstə, böyük dəstələr halında, izdihamla. *Gəlin alay-alay! Gəlin nəsillər; Hamımız bir nəfəs, bir ürək kimi.* S.Vurğun. *Gəzərkən buludlar hey alay-alay; Arxadan boylanır sarı saçlı ay.* R.Rza. *Bizim əsgər sıraları; Keçirdilər alay-alay.* N.Rəfibəyli.

**ALA-YARIM(ÇIQ)** *sif.* və *zərf* Yarımçıq, natamam, ala-babat, qeyri-kamil. *Qabı ala-yarımçıq doldurmaq. – Vanyuşa onları dinləyə-dinləyə Azərbaycan dilini ala-yarımçıq öyrənmişdi.* A.Şaiq. *Qaraca qız özünə gəlib, yol uzunu başına gələn əhvalatı ala-yarımçıq nağıl etdi.* S.S.Axundov. // Başdansovma. *Ala-yarımçıq iş. – Sübhanverdizadə üzünü kəsə-kəsə, dəryazla ot biçən kimi, tüklərini bir növ ala-yarımçıq biçib qurtardı.* S.Rəhimov.

**ALA-YARIMÇIQLIQ** *is.* Natamamlıq, atüstülük, ala-yarımçıq görülmüş iş.

**ALA-YARIMÇILIQ** b a x **ala-yarım(çıq).** [Cəmil:] *Bu saat ala-yarımçılıq biliklə nə eləmək olar*. M.Hüseyn.

**ALA-YETİŞMİŞ** b a x **ala-dəymiş.**

**ALAYONCA** *is.* Yarı yonca, yarı əkin.

**ALAZLAMAQ** *f. məh.* Alışdırmaq, qızartmaq (kömürü).

**ALAZLANMAQ** *f. məh.* Alışmaq, qızarmaq, alışıb-yanmaq (kömür).

**ALBALI** *is.* Tündqırmızı rəngli, tumlu, şirəli giləmeyvə; gilənar. *Albalı mürəbbəsi. Albalı ağacı. – Albalı ağacı meyvəli bitkilərdən olub, ən çox Zaqafqaziyada və Orta Asiyada becərilir.* R.Əliyev ☐ **Albalı rəngli** – qıpqırmızı. *Kiçikbəyim albalı rəngli dodaqlarını xoş bir əda ilə büzdü.* Çəmənzəminli.

**ALBALILIQ** *is.* Albalı bağı; albalı ağacları əkilmiş yer.

**ALBAN** *is.* 1. Albaniya Xalq Respublikasının əsas əhalisinin adı və bu xalqa mənsub adam; arnaud.

2. *tar.* Azərbaycanın şimal hissəsində yaşamış qədim xalqın adı. *..Albanlar qırx min nəfərlə gözlənmədən Pompey ilə müharibəyə gəldilər.* A.Bakıxanov.

**ALBANCA** *sif.* və *zərf* Alban dilində.

**ALBİNÍZM** [*lat.*] *biol.* Piqment azlığı nəticəsində dəri və saçların qeyri-normal ağlığı və gözlərin qırmızılığı.

**ALBİNÓS** [*lat.*] *biol.* Albinizmi olan adam, ya heyvan.

**ALBÓM** [*fr.*] 1. Şeir və s. yazmaq, şəkil çəkmək, marka yapışdırmaq və s. üçün təmiz səhifələri olan kitab, ya dəftər. *Şəkil albomu. Şeir albomu. – Yenə də ruhumu kəsdi bu duyğu; Götür albomunu, mən deyim sən yaz!* S.Vurğun.

2. Ayrıca nəşr edilmiş şəkillər, cizgilər və s. kitabı. *Memarlıq albomu. Xalça albomu. – Memarlıq Akademiyasının Memarlıq Muzeyi yubiley üçün albom hazırlayıb çapa vermişdir.*

**ALBUXARA** *is.* Qurudulmuş Buxara gavalısı. [Şagird] *yerdə əyləşib ət doğramağa, məğzibadam, badımcan, albuxara təmizləməyə məşğul idi.* Ə.Haqverdiyev.

**ALÇA** *is.* Cır və peyvənd cinsləri olan çəyirdəkli turş və ya şirin yumru bir meyvə. *Cır alça. Alça qurusu. Turş alça. Alça mürəbbəsi. – Alça çiçəyini töküb bir balaca böyüyən kimi, göy olmağına baxmayaraq duz ilə yeyərdik.* S.S.Axundov. // Bu meyvənin ağacı. *Vaxt olmuşdu ki, .. meşədə cır alça çiçək açmışdı, .. qürbət ölkələrdən uçub gəlmiş qaranquş öz doğma yuvasına qayıtmışdı.* İ.Məlikzadə.

**ALÇACIQ** b a x **alçaqca.**

**ALÇAQ** *sif.* 1. Hündürlüyü, ucalığı az olan, yerdən, hər hansı bir səviyyədən azacıq hündür olan. *Alçaq dağ. Alçaq ev. Alçaq boy. Alçaq divar. – Alçaq yerdə təpəcik özün dağ sanar.* (Ata. sözü). *Bura darısqal, alçaq, yarıqaranlıq bir otaq idi.* Mir Cəlal. // Yer səthindən çox hündürdə olmayan, hündürlük məsafəsi az olan. *Alçaq uçuş. Alçaq buludlardan yağış səpələndi.*

2. Bəstəboy, boyu gödək. *Heç yadımdan çıxmır, konsul özü bir uca adamdır, amma mən alçaq adamam.* C.Məmmədquluzadə.

3. Yavaş, asta, aşağı. *Alçaq səs. Alçaq ton.*

4. *məc.* Pis, xarab, keyfiyyətsiz. *Alçaq mal. – Bazarın bir küncündə tikilmiş dükanın içində qədəkdən, bezdən, şaldan, alçaq çitlərdən tökülübdür.* M.F.Axundzadə.

*5. məc.* Rəzil, şərəfsiz, namərd, çox pis. *Birisi haqqında alçaq fikirdə olmaq. Alçaq fikirlər. Alçaq hərəkət. Alçaq adam. Müharibə qızışdıranların alçaq niyyətləri. – Bu cür alçaq və rəhmsiz adamlara bir dəqiqə olsa da həyat haramdır.* M.S.Ordubadi.

**ALÇAQBOY(LU)** *sif.* Boyu alçaq, bəstəboy. *Kərbəlayı Qulu alçaqboylu bir kişi idi. Onun qızarmış burnu nazik bığlarının ortasına dik uzanmışdı..* Çəmənzəminli.

**ALÇAQCA** *sif.* Bir az alçaq. *Alçaqca divar. Alçaqca kişi.*

**ALÇAQCASINA** *zərf* və *sif.* Xaincəsinə, rəzilcəsinə, şərəfsizcəsinə. *Alçaqcasına hərəkət etmək. Alçaqcasına böhtan.*

**ALÇAQDAN** *zərf* 1. Aşağıdan, yer səthinə yaxın. *Təyyarələr alçaqdan uçur. Volqa, Don çayından 44 metr alçaqdan axır.*

2. Pəstdən, yavaşdan. *Alçaqdan oxumaq.*

**ALÇAQLANDIRMAQ** b a x **alçaltmaq**.

**ALÇAQLANMAQ** b a x **alçalmaq**.

**ALÇAQLAŞDIRMAQ** *f.* Pisləşdirmək, alçaq etmək. *Uşaqların tərbiyəsində çubuq və sillə vurmaq onların əxlaqını pozur və təbiətlərini alçaqlaşdırır.* M.F.Axundzadə.

**ALÇAQLATMAQ** *f. dan.* Alçaq etmək, alçaq hala salmaq, yüksəkliyini azaltmaq, endirmək.

**ALÇAQLIQ** *is.* 1. Alçaq şeyin halı. *Damın alçaqlığı. Ağacın alçaqlığı. Divarın alçaqlığı.*

2. Boy qısalığı.

3. *məc.* Pislik, xarablıq, keyfiyyətsizlik. *Malın alçaqlığı. İş keyfiyyətinin alçaqlığı.*

4. *məc.* Rəzillik, şərəfsizlik, namərdlik; alçaq hərəkət. *Düşmənin alçaqlığı. Alçaqlıq etmək. – Bu çöhrələrdə yaltaqlıq, riya .. və alçaqlığın hər cürə şəklini görmək mümkün idi.* M.S.Ordubadi. *Dilaraya elə gəlirdi ki, Səlim dünyada hər bir alçaqlıq edə bilər.* M.İbrahimov.

**ALÇAQTƏPƏLİ** *sif.* Alçaq təpələr olan. *Alçaqtəpəli yer.*

**ALÇALDILMA** "Alçaldılmaq"dan *f.is.*

**ALÇALDILMAQ** *məch.* 1. Alçaq edilmək, gödəldilmək, boyu qısaldılmaq.

2. *məc.* Təhqir edilmək, nüfuzdan salınmaq, hörmətdən salınmaq. [Şəmsiyyə:] .. *Lakin alçaldılmış, təhqir olunmuş bir qadın qəlbində siz bütün ömrünüzü çürüdəcək zəhərdən başqa nə tapa bilərsiniz?* M.İbrahimov.

3. Vəzifəsi, rütbəsi aşağı salınmaq.

4. Yavaşıdılmaq, astalaşdırılmaq, zəifləndilmək. *Səsi alçaldılmaq.*

**ALÇALIQ** *is.* Alça bağı, alça ağacları əkilmiş yer.

**ALÇALMA** "Alçalmaq"dan *f.is.*

**ALÇALMAQ** *f.* 1. Aşağı düşmək, gödəlmək, boyu qısalmaq. *Çayın kənarı seldən alçalmışdır.* // Enmək, aşağı salınmaq. *Əziz qonaq pilləkənlərdən qalxdıqca onun intizarında duran başlar da alçalırdı.* M.S.Ordubadi.

2. Azalmaq, zəifləmək, düşmək. *Səsi alçalmaq. Motorun səsi gah alçalır, gah güclənir. Çayda suyun səviyyəsi alçalmışdır. – Burada, öz-özü ilə danışırmış kimi, qadının səsi alçaldı.* Ə.Əbülhəsən.

3. *məc.* Rütbədə, vəzifədə kiçilmək, hörmətdən, nüfuzdan düşmək.

4. Özünü alçaltmaq, yaltaqlanmaq, izzətinəfsini itirmək. *Alçala-alçala yüksələnlər; Yüksələ-yüksələ alçalanlar gördüm.* B.Vahabzadə.

**ALÇALTMA** "Alçaltmaq"dan *f.is.*

**ALÇALTMAQ** *f.* 1. Alçaq etmək, boyunu qısaltmaq, hündürlüyünü azaltmaq; gödəltmək. *Hasarı alçaltmaq. Pəncərə yerini alçaltmaq. Stolun qıçlarını alçaltmaq. Damı alçaltmaq.*

2. *məc.* Birinin vəzifəsini, rütbəsini aşağı salmaq, daha aşağı vəzifəyə keçirmək. *Vəzifəsini alçaltmaq. Qulluğunu alçaltmaq.*

3. *məc.* Hörmətdən salmaq, heysiyyətini, mənliyini təhqir etmək. *Özünü alçaltmaq. – "Aydın", "Oqtay Eloğlu"* (*pyesləri*) .. *insanı alçaldan, məğrur qəhrəmanları bir heç dərəcəsinə endirən, təmiz və pak məhəbbətləri pozub solduran mühitin çəngindən qurtarmaq yolunu göstərə bilərdi.* M.İbrahimov. *Əgər sən varsansa... Keçib özündən; Özünü bu qədər alçaltmaq nədir?* B.Vahabzadə. *Sən sözü alçaltdın özündən əvvəl; Alçaltdın bir ağız afərin üçün.* M.Araz.

4. Pisləşdirmək, xarablaşdırmaq, aşağı salmaq. *Məhsulun keyfiyyətini alçaltmaq.*

5. Azaltmaq, aşağı salmaq, zəiflətmək. *Səsini alçaltmaq. Tonu alçaltmaq. – Cavahir sanki qızının* [Ağcanın] *eşidəcəyindən ehtiyat edərək səsini alçaltdı.* İ.Məlikzadə.

**ALÇI** *is.* Aşıq-aşıq oyununda: aşığın bir üzü, toxan üzün arxa tərəfi. *İkinci aşıq isə başqalarının əli ilə oynadılır, gah alçı durar, gah toxan. Belələrinə maça da deyilir. – Oynayanların birisi aşığın alçı durduğunu sübut etdikdə, o birisi aşığın alçı durmayıb, ancaq palazın qırışığına söykənib alçıya bənzədiyini söyləyir.* Ə.Haqverdiyev.

◊ **Aşığı (maçası) alçı durmaq** – 1) aşığın, udmaq əlaməti olaraq yanı üstə durması. [Toyda] *kimin qabağında maça alçı dursaydı, onu "xan" seçərdilər.* H.Sarabski; 2) *məc.* Hər cəhətdən bəxti gətirmək, işi düz gətirmək.

**ALÇIDAŞI** *is.* İnşaatda işlənilən daş növü.

**ALDADICI** *sif.* 1. Tovlayan, yoldan çıxaran, başdan çıxaran, hiyləgər; yalan. *Aldadıcı sözlər. Aldadıcı hərəkət.*

2. Asanlıqla aldada bilən, zahiri görünüşü ilə adamın etimadını qazana bilən; yalançı. *Zahiri görünüş aldadıcıdır. Aldadıcı ümidlər. – Zahir aldadıcı olur, deyirlər.* M.İbrahimov.

**ALDADICILIQ** *is*. Aldatma işi, yoldan çıxarma, başdan çıxarma; yalançılıq. [Qətibə Toğrula:] *Xüsusən sizdə olan aldadıcılıq və dostlara yalan satmaq sizin taxt-tacınızın zavalını yaxınlaşdırmaqdadır.* M.S.Ordubadi.

**ALDADILMA** "Aldadılmaq"dan *f.is.*

**ALDADILMAQ** *məch*. Tovlanmaq, yoldan çıxarılmaq, başdan çıxarılmaq.

**ALDANIŞ** *is.* Aldanma.

**ALDANMA** "Aldanmaq"dan *f.is.*

**ALDANMAQ** *f.* 1. Hiyləyə uymaq, yalan vədlərə uymaq, yalan sözü doğru saymaq, başdan çıxmaq. *Aldanmaram ki, doğrudur ayinin, ey əmu; Kəssin məni həqiqi isə dinin, ey əmu!* M.Ə.Sabir.

2. Ümidi boşa çıxmaq, yanılmaq. *Öz fikrimdə aldandım.*

**ALDATMA** "Aldatmaq"dan *f.is.*

**ALDATMAQ** *f.* 1. Qəsdən yayındırmaq, başını tovlamaq, yoldan çıxarmaq. *Təcrübəsiz adamı aldatmaq asandır. – Aldada bilməmiş dünyanın varı; Bir məslək eşqiylə yaşayanları.* S.Vurğun.

2. Yalan danışmaq, əsli olmayan bir şeyi doğru bir şey kimi göstərmək. *Xacə, aldatma bizləri sözünə!* M.Ə.Sabir.

3. Sözünün üstündə durmamaq, vədini yerinə yetirməmək, vədini pozmaq. *Gəlməyə söz vermişdi, aldatdı, gəlmədi.*

4. Xəyanət etmək (ərinə, arvadına, yoldaşına). *Ərini aldatmaq. Arvadını aldatmaq. Yoldaşını aldatmaq. – Məni də arif kimi bəxtim yaman aldatdı…* Şəhriyar.

**ALDƏYİŞİK** *is. dan.* 1. Bir şeyi verib, əvəzində başqa şey alma; mübadilə.

2. Eyni cinsdən olan şeyləri dəyişik salma.

**ALDI-QAÇDI** *zərf dan.* 1. Kos oyunu, top-top oyununun bir növü.

2. Başlı-başınalıq, hərki-hərkilik, hərcmərclik.

**ALDIRMA** "Aldırmaq"dan *f.is.*

**ALDIRMAQ** *icb.* 1. Almağa məcbur etmək, almasına səbəb olmaq. *Bu kitabı ona mən aldırmışam.*

2. Başqasının vasitəsilə almaq, almağa adam göndərmək. *Gözəl bir şey aldırmışam. Bir adam olsaydı, bazardan göyərti aldırardıq.*

3. Çəkdirmək. *Birinci səhifədə gənc Nina-nın məktəbdə ikən aldırdığı fotoqrafını gözdən keçirdim.* M.S.Ordubadi. [Səlim] *təlim zamanı Kərimlə birlikdə aldırdığı qoşa şəkli də* [paketə] *qoydu.* S.Rəhimov.

4. Üzdən kəsdirmək, götürmək (qayçı və s. ilə). *Hələ keçən iləcən üzünə ülgüc dəyməmiş Cəmil, indi saqqalını tərtəmiz qırxdırıb qara, nazik bığının üstünü azacıq aldırmışdı.* M.Hüseyn. ☐ **Üz aldırmaq, qaş aldırmaq** *dan.* – üzündəki (qaşındakı) artıq və narın tükləri çəkdirmək (qadınlarda).

**ALDIRMAMAQ** *f.* Əhəmiyyət verməmək, fikir verməmək, qulaq asmamaq, vecinə almamaq, saymamaq. *Nə qədər söylədimsə, aldırmadı. – Nəhayət, Əmir özünü aldırmadan dedi: – Şairin dili öz xalqının iradəsidir.* M.S.Ordubadi.

**ALEBÁSTR** [*yun.*] Divara suvaq çəkmək üçün, yaxud heykəltəraşlıq işlərində və cərrahlıqda işlədilən ağ gips; kəc.

**ALEÚT** is. Aleut və Komandor adalarının əsas əhalisinin adı və bu əhaliyə mənsub adam.

**AL-ƏLVAN** *sif.* Rəngbərəng, ala-bəzək. *Dağlar başı al-əlvan; Halım olubdur yaman; Gedirəm halal eylə; Gəlməyimə yox güman.* (Bayatı). *Gördüm ki, bir rəna çəmənlikdəyəm; Dörd yanımda var al-əlvan çiçəklər.* A.Səhhət.

**ALƏM** *is.* [*ər.*] 1. Kainat, dünya, yer üzü. *Qış günü qurtarmaqda idi, üfüqlərdən qatı bir qaranlıq aləmə yayılırdı.* M.İbrahimov. // Məc. mənada. *Ey Füzuli, aləmin gördüm qamu nemətlərin; Hiç nemət görmədim didari-dilbər tək ləziz.* Füzuli. *Təbii qanun hamı insanlar üçün bir gərəkdir ola, hamı insanlar bir nöqtəyə gərəkdir yürüş etsinlər. Bu nöqtə isə hürriyyət, məhəbbət aləmidir.* N.Nərimanov. *Aləmin seyrinə gəl, gör nə gözəl fitrəti var.* S.Vurğun. // Dünya və onda olan bütün varlıq, mövcudat, insanlar; təbiət. *Mühitin təsiri altında baş-beynimizdə ətrafdakı aləmin cisim və hadisələrinin surətləri əmələ gəlir.* Hacıyev.

2. Kainatın, təbiətin hər hansı bir sahəsi, qismi. *Ulduzlar aləmi. Günəş aləmi. Heyvanlar aləmi. Canlı aləm öz quruluşu və key-*

*fiyyəti ilə cansız təbiətdən fərqlənir. – Qoruğun bitkilər aləmi xüsusilə rəngarəngdir.*

3. *məc.* Məfhumlar, hisslər, təəssürat, təsəvvürlər, həyəcanlar mühiti. *Xəyal aləmi. Röya aləmi. Başqa bir aləmdə yaşamaq. – Kölgəyə aldanaraq sevmə cəfa aləmini; Yüksəl ülviyyətə, seyr eylə səfa aləmini!* A.Səhhət. *Bir bayram sözü var, bir də ki, matəm; Nəşə bir aləmdir, qüssə bir aləm.* S.Vurğun. *Mən bunları xatırlayır, açıq ana ürəyinin qapalı aləmini düşünürdüm.* Mir Cəlal. ☐ **Öz aləmində** – 1) öz təsəvvüründə; 2) öz miqyasında, öz mühitində, öz dairəsində.

4. Xalq, camaat, el, bütün adamlar, insanlar. *İnsan özü-özünə elədiyini aləm yığılsa, eyləyə bilməz.* (Ata. sözü). *Dostum, aləm səninçün gər olur düşmən mana; Qəm degil, zira yetirsən dust ancaq sən mana.* Füzuli. *Vidadiyəm, aləm tanır dərdimdən.* M.V.Vidadi. *Seyyid, yetişib aləmə fəryadü fəğanın.* S.Ə.Şirvani. *Bu gün bir süngüdür əlimdə qələm; Mənim bayrağıma göz dikir aləm.* S.Vurğun. *Şerim, bu hikməti aləmə bildir; Xəyal ölənləri bəzən dirildir.* M.Rahim. // Hər hansı əlamətlərinə görə birləşmiş insan cəmiyyəti, ictimai mühit. *Orta əsr aləmi. Şərq aləmi.* // İnsanların ictimai peşə, mədəniyyət, məişət və s. cəhətdən götürülən ayrıca bir qismi, təbəqəsi, sinfi, qrupu. *Nərgiz xanımın kitabxanası isə həkimlər aləmində qibtə doğuran, çox zəngin kitabxana idi.* Ə.Məmmədxanlı. // *məc.* İnsanların müəyyən fəaliyyət sahəsi. *Sənət aləmi. – Sonra bir həkim çıxdı. Yaş dəsmal üsulunun elm aləmində bir inqilab olduğunu söylədi.* Mir Cəlal. // *məc.* Mühit. [Nümayəndə:] *Keçmişdə qab-qazan aləmindən savayı bir şey tanımayan qadınlar, indi iş başına keçib, böyük-böyük idarələri dolandırırlar.* Ə.Haqverdiyev.

5. *məc.* Çox maraqlı, cazibəli, diqqəti cəlb edən, zövq və nəşə verən, tamaşalı, özünə məxsus gözəlliyi olan şey haqqında deyilir və başqa keyfiyyət bildirir. *Bizim Göygöl qəribə aləmdir! – Gözəl bir musiqi alətində çox bəyəndiyin bir havanı sevdiyin qızın çalmasından .. duyulan zövq və nəşə də bir ayrı aləmdir.* M.S.Ordubadi. *Gecə yarı dənizin bir özgə aləmi var.* Ə.Cəmil.

6. “Bir” sözü ilə bərabər: **bir aləm, bir aləmcə** – çoxlu, külli miqdarda, saysız-hesabsız. *Bir aləm şey. Bir aləm iş var. – Qayınana mırtıldanırdı: – Oğlum yazıq oldu! Bir aləmcə xərc tökdük.* Mir Cəlal. ☐ **Gecənin bir aləmində** – gecə hamı yuxuda olduğu bir vaxtda, gecə yarısı. [Əmniyyəbaşı:] *Gecənin bir aləmində yavaşca yerimdən tərpəndim..* M.İbrahimov.

**ALƏMARA(Y)** *sif.* [*ər.* aləm və *fars.* ara] *klas.* Dünyanı bəzəyən, dünyanın bəzəyi olan, gözəl, parlaq. *Şəmi-ruyin afitabi-aləmaradır sənin.* Füzuli.

**ALƏM-AŞKAR** *sif.* və *zərf* [*ər.* aləm və *fars.* aşkar] Apaydın, açıqdan-açığa, hamıya məlum olan; hamının gözü qabağında olan. *Nə olur danmaqdan, daldalanmaqdan; Düşkününəm aləm-aşikar sənin.* Q.Zakir.

**ALƏMƏFRUZ** *sif.* [*ər.* aləm və *fars.* əfruz] *klas.* Dünyanı işıqlandıran; aləmi bəzəyən, gözəlləşdirən. *Bir gün ki, bahari-aləməfruz; Vermişdi cahana feyzi-novruz.* Füzuli.

**ALƏMGİR** *sif.* [*ər.* aləm və *fars.* gir] *klas.* 1. Aləmə yayılan, dünyanı tutan (səs, şöhrət, şayiə və s.).

2. Dünyanı tutan, istila edən; cahangir.

**ALƏMŞÜMUL** *sif.* [*ər*] Bütün dünyaya şamil olan, bütün dünyaya aid olan, bütün dünya üçün əhəmiyyəti olan. *Aləmşümul əhəmiyyəti olan hadisələr. Aləmşümul tarixi qələbələr.* // Aləmə yayılmış. *O məmləkətlərin heç birində Məhsəti xanım kimi aləmşümul şöhrətə malik olan bir qadın nəzərimə dəyməmişdir.* M.S.Ordubadi.

**ALƏMTAB** *sif.* [*ər.* aləm və *fars.* tab] *klas.* Dünyanı işıqlandıran, cahanı parladan. *Şeyx Sənan, o şəmsi-aləmtab; Oldu kafər, xaç asdı, içdi şərab.* H.Cavid.

**ALƏT** *is.* [*ər.*] 1. Bir iş görmək, yaxud şey qayırmaq üçün işlədilən texniki vasitə, karastı və s. *İstehsal alətləri. Kənd təsərrüfatı alətləri. Dülgərlik alətləri. Əmək alətləri.* – [Həyat:] *Kolxozlardan təmir üçün gələn alətlər əl dəyilməmiş qalır.* M.İbrahimov. // Cihaz. *Çəki alətləri. Ölçü alətləri. – Ruzgarın piş-əz-vəqt dəyişilməsini bilməkdən ötrü bir alət ixtira ediblər ki, adına mizanülhava* (*barometr*) *deyirlər.* H.Zərdabi.

2. Musiqi səsləri çıxarmaq üçün xüsusi cihaz. *Çalğı aləti. Simli musiqi alətləri.*

3. *məc*. Hər hansı bir məqsədi əldə etmək üçün vasitə. *Əldə alət olmaq. Əlində alət etmək. – Məsciddə həsiri eləmə aləti-təzvir; Mərdanə qədəh tut, bu riyadən dəxi ar et.* S.Ə.Şirvani. *Müstəbidlər yaşamaqçün rahət; Şairi əldə ediblər alət.* A.Səhhət. *Əvvəlcə Hacı Səməd xanın çar konsulu əlində alət olduğunu ifşa etmək .. lazım idi.* M.S.Ordubadi.

**ALƏTÇİ** *is. xüs.* Alət qayıran usta.

**ÁLFA** [*yun.*] Yunan əlifbasının birinci hərfinin adı ($\alpha$).

**ALĞI** *is*. Satın alma işi.

**ALĞI-SATQI** *is*. Alıb-satma işi, alver.

**ALI** *is*. Albuxara, qurudulmuş Buxara gavalısı.

**ALIB-ALACAQ** *dan.* b a x **alacaq.**

**ALIB-ALDATMAQ** *dan.* b a x **aldatmaq** 1 və 2-ci mənalarda.

**ALIB-SATMA** *is.* Alış-veriş, alğı-satqı.

**ALIB-SATMAQ** *f.* Alış-verişlə məşğul olmaq. *Adamlar .. yenə də öz işlərinə, alıb-satmağa, bir-birini itələyib yol açmağa başladılar.* M.İbrahimov.

**ALIB-VERƏCƏK** *is. dan.* Əlaqə, iş. *..Mən müsəlmanam və bir də Mustafa bəynən mənim nə alıb-verəcəyim var..* C.Məmmədquluzadə.

**ALICI**[1] 1. *is.* Müştəri, mal alan, şey alan. *Bu malın alıcısı yoxdur. Alıcılara mədəni xidmət. Alıcıların tələbatını nəzərdə tutmaq. – Satıcılar tərifləyir, alıcılar müştəri gözü ilə bir çox nöqsanlar tapır və pisləyirdilər.* S.Rəhimov.

2. *sif.* və *is.* Təhvil verilən məhsulu, malı və s.-ni qəbul edib, əvəzində pul və kağız (qəbz) verən. [Zərbəçi qadınlar] *pambığın qurusunu alıcı məntəqəsinə təhvil verirdilər.* Mir Cəlal.

**ALICI**[2] *sif.* 1. Yırtıcı, ovçu (quşlar haqqında). *Yolun ortasına bir nal qırığı düşmüşdü. Kiçikbəyim uzaqdan bunu gördü, çapa-çapa yaxınlaşdıqda, alıcı quş sürəti ilə enib, nalı qaldırdı.* Çəmənzəminli. *Onun baxışları alıcı tərlan baxışları kimi kəskindir.* S.Vurğun.

2. *məc*. İtigörən, cəld, sayıq. [Qayıqçı] *arabir alıcı gözlərini sahilə dikib bir şey axtarırmış kimi baxırdı.* A.Şaiq. *Silahlı qardaşım, sərhəd boyunca; Alıcı gözlərin qızılquş olsun!* S.Vurğun.

**ALICILIQ** *is. iqt.* Satınalma imkanı, qabiliyyəti. *Əhalinin alıcılıq qabiliyyəti. Manatın alıcılıq qüvvəsi.*

**ALIQ** *is. köhn.* Öküz, kəl və başqa yük heyvanlarının belinə palan əvəzinə qoyulan çul, keçə və s. yumşaq şey. *Sən ki alığa da möhtac olursan; Əbəs yerə neçin zəhmət elərsən.* M.V.Vidadi. *Sahibləri çulun, alığın soydu.* Q.Zakir.

◊ **Alığını aşırmaq** – öhdəsindən gəlmək, devirmək. *Bəyi .. yola salmışıq, lap bizim hökuməti quran günlər bəylərin alığını aşırdıq.* S.Rəhimov. *Çox belələrinin alığını aşırmışam.* M.Hüseyn.

**ALIQ-ALIQ** *zərf dan.* Heyran-heyran, mat-mat, təəccüblə. [Veys] *birdən-birə kar olmuş kimi alıq-alıq tanımadığı adama baxdı.* Ə.Əbülhəsən.

**ALIQLAMA** "Alıqlamaq"dan *f.is.*

**ALIQLAMAQ** *f.* Heyvanın belinə alıq qoymaq, çullamaq.

**ALIM** *is. köhn.* 1. Alacaq, tələb. *Altıda alımı yox, beşdə verimi.* (Məsəl).

2. Bir götürüm, bir tutum.

**ALIM-SATIM** *dan.* b a x **alğı-satqı**. *Bəndalının zamanında alım-satım hər şeyin hakimi idi.* Mir Cəlal.

**ALIN** *is.* 1. Üzün saç ilə qaş arasında olan ön hissəsi. *Geniş alın. Dar alın. – Süleyman bəy əyləşir yerdə, papağını çıxarıb qoyur yanına və dəsmalı ilə alnının tərini silir.* Ə.Haqverdiyev. [Gülbadam] *ağ kisəyi köynəyinin enli qolları ilə uşağın alnındakı təri sildi.* N.Nərimanov.

2. *məc.* Bir şeyin ön tərəfi. *Alnından vurmaq.*

◊ **Alın təri** – zəhmət, əmək. **Alın təri ilə qazanmaq** – öz zəhməti ilə qazanmaq, öz əməyi ilə əldə etmək. **Alın təri tökmək** – çox zəhmət çəkmək, əmək sərf etmək. **Alın yazısı** *din.* – tale, qismət, qədər. **Alnı pak** – vicdanı təmiz, ləkəsiz, namuslu. **Alnında yazılmaq** *din.* – taleyi qabaqcadan müəyyən olmaq.

**ALINLIQ** *is. köhn.* Keçmişdə qadınların alınlarına bağladıqları qızıl, gümüş və s. bəzək.

**ALINMA** 1. "Alınmaq"dan *f.is.*

2. *is.* Satın alınmış şey.

3. *sif.* Başqa dillərdən alınmış. *Dilin lüğət tərkibindəki alınma sözlər.*

**ALINMAQ¹** "Almaq"dan *məch. Əmr alındı ki, hamı yola hazır olsun. Kitabxana üçün çoxlu kitab alınmışdır. Yeni məlumat alınmışdır. Mövzu xalq əfsanələrindən alınmışdır. Düşməndən çoxlu əsir alınmışdır. Daş kömürdən maye yanacaq alınır. Neftdən benzin alınır. Tədqiqatdan maraqlı nəticələr alınmışdır. – Nə üçün susdu natiqlər; Alındı həbsə sadiqlər?* M.Ə.Sabir.

**ALINMAQ²** *f. məh.* Söylənilən bir sözü öz hesabına götürüb tez pərt olmaq, inciмək, sınmaq, mütəəssir olmaq. *Alı kişi əhvalatı oğlanlarına xəbər verdi. Bu xəbərdən Nəbinin qardaşları çox alındı.* "Qaçaq Nəbi". *Mahmudov xeyli inciyib alındı.* S.Rəhimov. *Əlyarovun zəhmli səsindən zərrə qədər də alınmayan traktorçu saymazyana cavab verdi.* M.Hüseyn.

**ALINMAZ** *sif.* Alınması, ələ keçirilməsi mümkün olmayan; yenilməz. *Alınmaz qala.* // Məc. mənada. *Dağlarda laləm sənsən; Alınmaz qalam sənsən; Kimim yox, kimsənəm yox; Bir şirin balam sənsən.* (Bayatı). *Sənin ulduzlu alnında müzəffər, şanlı bir ordu; Bütün aləm qoşun çəksə, alınmazdır sözün yurdu!* S.Vurğun.

**ALINMAZLIQ** *is.* Alınması, ələ keçirilməsi mümkün olmama; yenilməzlik.

**ALIŞ** *f.is.* Almaq işi, alma, qəbul etmə, qəbul.

**ALIŞDIMYANDIM** *is. köhn. dan.* Zərlə ipəkdən toxunmuş parlaq parça; xara. *Səttar kişinin arvadı alışdımyandımdan özünə libas tikib.* N.Vəzirov. *Salon. Qabaq sırada əyləşib bir nazənin; Əynindəki paltarı alışdımyandımdandı.* R.Rza.

**ALIŞDIRILMA** "Alışdırılmaq"dan *f.is.*

**ALIŞDIRILMAQ¹** *məch.* Yandırılmaq. *Mağazanın içindəki lampalar alışdırıldıqdan sonra çəkilib hamı qapı içində dayandı.* Ə.Əbülhəsən. // Alovlandırılmaq.

**ALIŞDIRILMAQ²** *məch.* 1. Öyrədilmək, öyrəndirilmək, vərdiş olmasına səbəb olmaq. // Dadandırılmaq.

2. Əhliləşdirilmək, ələ öyrədilmək.

**ALIŞDIRMA¹** "Alışdırmaq¹"dan *f.is.*

**ALIŞDIRMA²** "Alışdırmaq²"dan *f.is.*

**ALIŞDIRMAQ¹** *f.* 1. Yandırmaq, yaxud yanan şeyi daha da qızışdırmaq, alovlandırmaq. *Ocağı alışdırmaq. Tonqalı alışdırmaq. Külək yanğını daha da alışdırıb gücləndirdi.* – [İlyas:] *İşdən qayıtdımmı, beş dəqiqənin içində görürsən, pilətəni alışdırdım.* Mir Cəlal.

2. *məc. dan.* Bərk hirsləndirmək, acıqlandırmaq, hiddətləndirmək, qızışdırmaq.

**ALIŞDIRMAQ²** *f.* 1. Öyrətmək, öyrəşdirmək, vərdiş etməsinə səbəb olmaq. *Zəhmətə alışdırmaq. Özünü soyuğa alışdırmaq. Uşaqları kiçik yaşlarından başlayaraq sağlamlıq qaydalarına alışdırmaq lazımdır. – Mən Şümşad xanımın onu* [Miss Hannanı] *dua yazdırmaq və fal açdırmağa alışdırdığını bilirdim.* M.S.Ordubadi. *Güldü Bənna: – Bəli, – dedi, – gərək tələsək; Cəld olmağa alışdıraq hər bir naşını.* Ə.Cəmil.

2. Əhliləşdirmək, ələ öyrətmək, təlim etmək, isinişdirmək. [Ovçular qızılquş balalarını] *iki-üç gün ac saxlar və yavaş-yavaş ət verib özlərinə alışdırdıqdan sonra, göz qapaqlarını açarlar.* A.Şaiq.

3. Canına salmaq. *Səlim bəy Nəbinin başı üçün çoxlu maya verməyi öhdəsinə aldı. Hampaları alışdırdı kəndlərə.* "Qaçaq Nəbi".

**ALIŞIB-VERİŞMƏK** *f. dan.* Öz aralarında kəsdirmək, qət etmək, qərara almaq, sözləşmək. [Anam:] *Zəhmət çəkib qız böyütmüşük. Sənin nə haqqın var alışıb-verişəsən, ay ərkansız!* Mir Cəlal.

**ALIŞIQ¹** *is.* Ocağı alışdırmaq üçün gözünə, yaxud samovarın odluğuna qoyulan yonqu və s. *A mollalar, niyə məni döyürsünüz? ..Olmaya qorxursunuz ki, məcmuənin vərəqələrini nökərlər samovar alışığı edə-edə və şəkillərini uşaqlar oynada-oynada axırda camaat gözünü açıb bəzi işlərdən xəbərdar ola.* C.Məmmədquluzadə.

**ALIŞIQ²** *sif.* Alışmış, vərdiş olmuş, öyrəşmiş.

**ALIŞQAN¹** 1. *sif.* Tez alışan, tez yanan, tez alovlanan. *Alışqan maddələr. Efir alışqan maddədir.*

2. *is. dan.* Kibrit. // Papiros yandırmaq üçün alət. *Xəlil .. əlini cibinə salıb papiros çıxartdı. Tüfəng patronundan qayrılmış alışqanla yandırdı.* M.Hüseyn.

**ALIŞQAN²** *sif.* Bir şeyə vərdiş etmiş; adətkərdə, vərdişli.

**ALIŞQANLIQ** *is.* Tez alışan, tez yanan, tez alovlanan şeyin xassəsi.

**ALIŞMA¹** "Alışmaq¹"dan *f.is.*

**ALIŞMA²** "Alışmaq²"dan *f.is.*

**ALIŞMA³** *is. məh.* Bir neçə adamın şərikli qoyun və ya mal kəsməsi. [Bəxti:] *Ay balam, mənim öz ətim ola-ola, niyə qoca inəyə alışma olum.* S.Rəhimov.

**ALIŞMAQ¹** *f.* Odlanmaq, alovlanmaq, od tutub yanmaq. *Ocaq alışdı. Benzin qabı birdən alışdı. Taya ildırımdan alışdı.* // məc. mənada. *Alışıb, şölə çəkib suz ilə yandım, gördüm; Hicrini atəşi-suzan dedilər, gerçək imiş.* S.Ə.Şirvani. *Canım üzülür əldəki qalxanına baxcaq; Qəlbim alışır beldəki patronunu görcək.* M.Ə.Sabir. *Arvad, ürəyim od tutub alışır, məni daha artıq yandırma.* Ə.Haqverdiyev. ☐ **Alışıb yanmaq** – 1) od tutub yanmaq, şiddətlə yanmaq, alovlanmaq. *Küləş alışıb yandı. – Belə bir isti torpağa saldı; Alışıb yanmağa çöl az qaldı.* A.Səhhət; // məc. mənada. [Ağca xanımın] *gözü İzzətin yatağına sataşanda ürəyi alışıb yanırdı.* Mir Cəlal; 2) alov rəngində parlamaq, alov kimi al-qırmızı rəngə çalıb parıldamaq. *Qızlar bütün bəzəklərini taxmışlar, üst-başları rəngdən-rəngə girərək, alışıb yanır.* S.Rüstəm; 3) *məc.* qızarmaq. *Yanaqları çiçək kimi alışıb yanır.*

**ALIŞMAQ²** *f.* 1. Öyrəşmək, vərdiş etmək, adət etmək. *Soyuğa alışmaq. Papirosa alışmaq. Zəhmətə alışmaq. – Ata hər gün gedər işə, çalışar; Nə qədər zəhmət olsa da alışar.* M.Ə.Sabir. [Əzim dayının] *daima qapalı və incə dodaqları ancaq ən mühüm fikirlərini anlatmaq üçün açılmağa alışmışdı.* A.Şaiq. [İsfəndiyar] *əlini alnına dayadı və bir neçə saniyə dayanıb qaranlığa alışmaq istədi.* M.Hüseyn. // *məc.* Ünsiyyət bağlamaq, isinişmək, öyrəşmək.

2. Dadanmaq, öyrəşmək. *Çaqqal toyuq damına alışıb, hər gecə bir toyuq aparır. İt qonşu həyətə alışıbdır.*

3. Əhliləşmək, ələ öyrənmək, isinişmək. *Nə qədər əlləşdilərsə də, tülkünün balası evə alışmadı.*

**ALIŞMALIQ** *sif. məh.* Alışma üçün qoyulan, ayrılan (b a x **alışma**³). *Alışmalıq qoyun.*

**ALIŞ-VERİŞ** *is.* 1. Alver, ticarət, alğı-satqı. *Alış-verişlə məşğul olmaq. – Hər bazar günü bu meydanda iyirmi-otuz min manatlıq alış-veriş olur.* Ə.Haqverdiyev. [Hacı Saleh:] *Alış-veriş belədir ki, beşinə sən borclu olursan, beşi də sənə.* S.S.Axundov. *Pəh, pəh, pəh!.. Afərin belə qazanca, afərin belə alış-verişə!* C.Məmmədquluzadə.

2. *məc.* İş. *Mənim anam ölsün, tamam vilayətin alış-verişi mənimlədir.* N.Vəzirov.

**ALIŞ-VERİŞÇİ** *is.* Alış-verişlə məşğul olan adam, alverçi. [Allahqulu:] *Gəlib bir yerə çıxdıq; alış-verişçilər həndəvərimizi aldı.* Çəmənzəminli. *On beş il bundan əvvəl bu kəndə şəhərdən bir nəfər alış-verişçi gəldi.* M.S.Ordubadi.

**ALİ** *sif.* [*ər.*] 1. Ən yüksək, ən baş, ən yuxarı. *Ali məhkəmə. Ali baş komandan. Ali idarələr. Ali məktəb. Ali təhsil.* – [Nizami:] *Bunlar ancaq tərbiyə və istedadın nəticəsində incəsənətin bu qədər ali dərəcəsinə çıxa bilmişlər.* M.S.Ordubadi. [Qasım:] *İşə iki dəfə Ali məhkəmədə baxıblar. Yenə də əl çəkən deyiləm.* S.Rəhman.

2. Uca, hündür, yüksək. *Hülaku xan paytaxtı Təbriz şəhərində ali bir imarət tikdirdi.* A.Bakıxanov. *Bakının ali imarətlərinə sərf edilən ağdaş Puta, Badamdar, Şağanbaz, Alaçıq deyilən yerlərdən gətirilir.* H.Sarabski.

3. Xüsusi terminologiyada: ən inkişaf etmiş, ən mükəmməl, ən mürəkkəb. *Ali sinir fəaliyyəti. Ali orqanizmlər.* – [Spirtin] *orta nümayəndələri kəskin iyli, ali spirtlər isə iysizdir.* Mövsümzadə.

**ALİCAH** *is.* [*ər.*] *klas.* Yüksək rütbəli, uca mənsəbli adam.

**ALİCƏNAB** *sif.* [*ər.*] 1. Başqalarının xatirinə öz şəxsi mənafeyindən keçən; namuslu, səxavətli, nəcib, nəcabətli. *Alicənab adam. Alicənab hərəkət. Alicənab xasiyyət.* – [İbrahim xan] *özünü alicənab* (z.) *göstərmək üçün, bu fürsətdən istifadə edərək, arvadların buraxılmasını tapşırdı.* Çəmənzəminli.

2. *köhn.* Keçmişdə böyük mənsəb və rütbə sahiblərinə verilən ünvan. [Cəfər:] *Alicənab xan həzrətlərinin xidmətində and içirəm əzizlərimin canına ki, Moskvadakı uşağınızdan yana mən bir söz eşitməmişəm.* C.Məmmədquluzadə.

**ALİCƏNABLIQ** *is.* Nəciblik, nəcabət, mərdlik, safqəlblilik, səxavət; alicənab hərəkət. *Alicənablıq göstərmək. – Nazimənin qarşısında minnətdarlıqla göz yaşları tökən ana, indi alicənablıqla* (z.) *oğlunu ilk dəfə ona təqdim edir..* Mir Cəlal. [Şeyda:] *Ah, bu nəvazişə, bu alicənablığa qarşı sıxılmamaq qabil deyil.* H.Cavid.

**ALİGÖVHƏR** *sif.* [*ər.* ali və *fars.* gühər] *klas.* Yüksək nəsildən olan, əsilli, əsilnəsəbli, əsilzadə.

**ALİM** [*ər.*] 1. *is.* Hər hansı bir elm sahəsində mütəxəssis olan adam. *Azərbaycan alimləri. Dünyada tanınmış alim. Alimin adını fikir tarixində ölməzləşdirən onun elə bir az da şairliyidir.*

2. *sif.* Elmli, bilikli, məlumatlı, çox oxumuş. *Alim adam yüksək əxlaqi keyfiyyətləri ilə seçilən fəzilət sahibidir.*

◊ **Alimi-biəməl** *zar.* – lazım olan bir şeyi başqalarına tövsiyə edib, özü buna əməl etməyən adam haqqında. [Səfər bəy:] *A kişi, Mirzə Turab, sənə kişi kimi söz deyirəm, siz iki qardaşsınız, ikiniz də alimvücudsunuz, hərçənd sən alimi-biəməlsən, bunun mətləbə dəxli yoxdur.* B.Talıblı.

**ALİMANƏ** [*ər.* alim və *fars.* ...anə] b a x **alimcəsinə.**

**ALİMCƏSİNƏ** *zərf* Alimə yaraşan bir tərzdə, bir alim kimi.

**ALİMENT** *is.* [*lat.*] *hüq.* Övlad və ya qohumluq əlaqəsinə görə verilməli olan məbləğ, dolanışıq haqqı, xərci (məs.: uşaqlarına, ata-anasına, arvadına və i.a.). *Alimentlər haqqında qanun. Aliment vermək.* – [Mindilli:] *Qəmər burdadır! Yaxşı ki, məni görmədi. Papağımı da satsam, dörd ilin alimentini verib qurtara bilməyəcəyəm.* S.Rəhman.

**ALİMƏKAN** *sif.* [*ər.*] *klas.* bax **aliməqam.**

**ALİMƏQAM** *sif.* [*ər.*] *klas.* Yüksək rütbəli, yüksək vəzifəli, yüksək mövqe tutmuş.

**ALİMƏNSƏB** *sif.* [*ər.*] *klas.* Yüksək mənsəb (vəzifə) sahibi olan.

**ALİMLİK** *is.* 1. Hər hansı bir elm sahəsində böyük bilik, dərin məlumat. *Onun alimliyinə şübhə yoxdur.*

2. Alimin peşəsi, sənəti. *Onun peşəsi alimlikdir.*

3. Alimə, elmə məxsus; elmi. *Alimlik dərəcəsi. Filologiya elmləri doktoru alimlik dərəcəsi.*

**ALİMNÜMA** *is.* [*ər.* alim və *fars.* nüma] *isteh.* Alim olmadığı halda özünü alim kimi göstərən, özünü alimə oxşadan adam, alim qiyafəsinə girən adam; yalançı alim.

**ALİMNÜMALIQ** *is. köhn.* Alim olmadığı halda özünü alim kimi göstərmə, özünü alimə bənzətmə, alim qiyafəsinə girmə; yalançı alimlik.

**ALİNƏSƏB** *sif.* [*ər.*] *klas*. Yüksək rütbəli, yüksək mənsəb sahibi olan.

**ALİŞAN**, **ALİŞƏN** *sif.* [*ər.*] *klas.* 1. Yüksək şan və şərəf sahibi olan. *Çox alişan nazəninlər görmüşəm; Sənin kimi şahzadə tapılmaz.* Q.Zakir. *Könül istər ki, olsun dəhr sülhabad ünsiyyət; Məni sövq eləyən bu fikrə fikri-alişanımdır.* M.Hadi.

2. Çox zəngin, dəbdəbəli, təmtəraqlı, cəlallı, bəzəkli. [Şah:] *..Dəxi mənim imarətim və dövlətim yoxdur ki, sizi ziynət və zivərdə və alişan otaqlarda saxlayım.* M.F.Axundzadə.

**ALİTƏHSİLLİ** *sif.* Ali məktəb bitirmiş. *Alitəhsilli mütəxəssis. Alitəhsilli müəllim.*

**ALİYƏ** *sif.* [*ər.*] *klas.* Uca, yüksək.

**ALİZARİN** [*fr.* əsli *ər.*] *tex. kim.* Boyaq deyilən bitki kökündən alınan, yaxud süni (sintetik) surətdə hazırlanan boyaq maddəsi. *Alizarin mürəkkəb. Alizarin boya.*

**ALKALÓİD** [əsli *ər.*] *kim.* Tərkibində azot və güclü fizioloji təsiri olan qələvi xassəli üzvi maddə. *Alkaloidlərin çoxu qiymətli dərman maddəsidir.*

**ALKOQÓL** *is.* [*ər.* "əlkühl" sözündən] 1. Spirt. *Sərxoşedici içkilərin hamısında başlıca təsir edən maddə .. alkoqoldur.* R.Əliyev.

2. Araq, ümumiyyətlə spirtli içkilər. *Alkoqol düşkünlüyü.*

**ALKOQOLİZM** Həddindən artıq spirtli içkilər içmə; spirtli içkilərə aludə olma; içki düşkünlüyü; əyyaşlıq. *Alkoqolizm ilə mübarizə. Alkoqolizmə mübtəla olma. Alkoqolizm psixi və fiziki pozğunluqlar törədir.*

**ALKOQOLLU** *sif.* Tərkibində alkoqol (spirt) olan, spirtli. *Alkoqollu içkilər. Alkoqollu içki orqanizm üçün ən güclü zəhərdir. – Alkoqollu içki orqanizmin hüceyrələrini*

*yavaş-yavaş zəhərləyir, sinir sisteminə çox böyük zərər yetirir.* R.Əliyev.

**ALKOQOLSUZ** *sif.* Tərkibində alkoqol (spirt) olmayan; spirtsiz. *Alkoqolsuz içkilər.*

**AL-QIRMIZI** *sif.* Tünd-qırmızı.

**ALQIŞ** *is.* 1. Birini təbrik üçün və ya bir şeyi bəyənmə ifadəsi olaraq əl çalma. *Sürəkli alqışlar. Gurultulu alqışlar. Alqış səsləri. – Xanəndə zilə çəkdiyindən, hamının gözü onda idi. Birdən alqışlar qopdu.* M.Hüseyn. *Alqış səsləri zalı doldurdu.* Ə.Vəliyev. // *Nida mənasında.* Əhsən, afərin, mərhəba. [Yanardağ:] *Alqış odlar gəlininə! Elə isə, bir yerdə son ibadətə başlayaq..* C.Cabbarlı. *Alqış deyir mənim doğma yurdum Azərbaycan da.* R.Rza. *Min nemət yetirir Vətən torpağı; Alqış mərd, qabarlı, qadir əllərə!* Ə.Cəmil.

2. *folk.* Şifahi ədəbiyyatda nəcib, xeyirxah diləyi ifadə edən və müəyyən mərasimlərlə bağlı arzuları bildirən söyləmə.

**ALQIŞLAMA** "Alqışlamaq"dan *f.is.*

**ALQIŞLAMAQ** *f.* Birini təbrik etmək üçün və ya bir şeyi bəyənmə ifadəsi olaraq əl çalmaq. *Artisti alqışladılar. Natiqi çox alqışladılar. – Qızlar oynamaqlarını bitirdilər, hər tərəfdən onları alqışladılar.* S.S.Axundov. // Təbrik etmək. *Alqışla insanın pak əməlini; Uzat yer üzünə hünər əlini.* S.Vurğun. *Bir vüqar duyaraq onun səsində; Yer, göy alqışladı bu qəhrəmanı.* M.Rahim. // Məc. mənada. *Kiçik quşlar .. gözəlliklərə baxır, o lətafətə bürünmüş təbiəti dadlı nəğmələri ilə alqışlayırdılar.* A.Şaiq. // Çox bəyənmək, tərifləmək, tam razılığını izhar etmək. *İrəli sürülən yeni təklifi hamı alqışladı. Onun bu gözəl təşəbbüsünü alqışlamaq lazımdır.*

**ALQIŞLANMA** "Alqışlanmaq"dan *f.is.*

**ALQIŞLANMAQ** *məch.* Əl çalınmaqla təbrik və təhsin olunmaq. *Əslinə baxsan,* [Gülnisə xala] *oğlunun ilk müvəffəqiyyət və alqışlandığını gördükdən sonra, bircə şeyi başa düşmüşdü.* Mir Cəlal. // Bəyənilmək.

**ALLAF** *is.* [*ər.*] *köhn.* Taxıl, un, yaxud yem, ot və s. alverçisi. *Allaf dükanı.*

**ALLAFBAZAR** *is.* [*ər.* əllaf və *fars.* bazar] *köhn.* Keçmişdə: allaf dükanları olan bazar, ya küçə.

**ALLAFLIQ** *is. köhn.* Allaf peşəsi.

**ALLAH** *is.* [*ər.*] 1. Bütün kainatın yeganə yaradıcısı və idarə edəni; Yaradan, Tanrı, Rəbb. *Lap qabaqlar Allahdan başqa heç kim yox imiş..* (Əsatir). *Allahın qəzəbi tutur, Adəmlə Həvvanı cənnətdən qovur..* (Əfsanə). *Qorqmazam bu dünyada heç kişidən; Canumun əmanəti Allahadur.* Q.Bürhanəddin. *O alma yanağı, büllur buxağı; Allah, bədnəzərdən salamət eylə!* M.P.Vaqif.

2. Qədim (çoxallahlı) dinlərdə təbiət fövqündə təsəvvür edilən vücud. *Qədim yunan allahları.*

3. *məc.* Hakim, ağa; heç kəsə tabe olmayan, azğınlıq edən, başlı-başınalıq edən adam haqqında. *Bunlar* [qoçular] *Quba meydanının allahı idilər.* H.Sarabski. *Napoleon dedi: – Göy Allahındır; Fəqət yer üzünün allahı mənəm.* S.Vurğun.

◊ **Allah ağıl versin** – ağılsız iş görən, hərəkət edən, yaxud söz danışan adam haqqında. **Allah amandır** – yalvarış, xahiş bildirir. [Axund:] *Allah amandır! Mənim evimdə qan tökməyin; siz allahınız, mənə dəyməyiniz.* B.Talıblı. **Allah bağışlasın** – üzr istəyən, yaxud günah bir iş görmüş adam üçün xeyir-dua. [Mirzə Heydər:] *Allah bağışlasın, bu nə sözdür, hacı, buyurursunuz?* Ə.Haqverdiyev. **Allah bəla(sını) versin** – danlaq, narazılıq ifadə edir. **Allah bəndəsi** – 1) bir adam, bir şəxs, bir nəfər. [Qulu:] *Arvadın yox, oğlun yox, bir qızın var, o da bu gün-sabah çıxıb Allah bəndəsinin birinə gedər.* S.S.Axundov; 2) fağır, sakit, yazıq. *Başmaqçı usta Ağabala Veylabad şəhərində beş kişinin biri idi. Saleh, salim, mömin, Allah bəndəsi bir şəxs idi.* Çəmənzəminli. **Allah bilir** – məlum deyil, heç kəs bilmir. [Babək:] *Hələ nə qədər bu şəhərdə qalacayıq Allah bilir.* Ə.Məmmədxanlı. **Allah canını alsın! (cəzasını versin!)** – məzəmmət, qarğış bildirir. **Allah eləməsin** – arzu edilməyən bir şey haqqında deyilir. [Sənəm:] *Xeyr, Allah eləməsin mən sənə nəsihət eləyim. Dəxi acığın niyə tutur?* Ə.Haqverdiyev. [Səba xanım:] *Allah eləməsin mən o həyada qız olum...* M.S.Ordubadi. **Allah eləsin (ki)** – arzu edilən bir şey haqqında deyilir. [Əşrəf bəy:] *Allah eləsin, Allah eləsin, ay kişi. Eşitdim özün də bir cahil*

*arvad almısan, doğrudurmu?* N.Vəzirov. **Allah eşqinə** – yalvarış, xahiş, iltimas bildirir. [Solmaz:] *Get, Allah eşqinə get! Mən heç bir zaman sənin olmayacağam.* C.Cabbarlı. **Allah evi** *din.* – məscid. **Allah xatirinə (eşqinə)** – təkidli xahiş bildirir. **Allah kömək eləsin! Allah köməyin(iz) olsun!** – işləyən, yaxud ağır vəziyyətdə olan bir adama müvəffəqiyyət arzusu. **Allah qoysa** – xoş arzu ifadə edir. [Nabat xala:] *Yaxşı yol, oğlum, sağ get, salamat gəl! Allah qoysa, qayıdıb toy tədarükünü görərsən.* B.Talıblı. **Allah qüvvət versin!** – b a x **Allah kömək eləsin! Allah köməyin(iz) olsun!** [Məcid:] *Allah qüvvət versin, ay Nadir, bu bəylərin əlindən canını yaxşı qurtardın.* B.Talıblı. **Allah mübarək eləsin!** – toy, bayram və s. münasibəti ilə təbrik. *..Hamı savadsız olduqlarından imza yerinə baş barmaqlarını basaraq bir-birinə: "Allah mübarək eləsin, Allah mübarək eləsin" – deyə bayıra çıxırlar.* B.Talıblı. **Allah rəhmətinə getmək** – ölmək. [Atası oğluna yazdı:] *Anan Allah rəhmətinə getdikdən sonra, doğrusu ki, dolanacaq mənim üçün çox çətin olmuşdur.* B.Talıblı. **Allah saxlasın** – 1) birinə cansağlığı və uzun ömür arzusu. *Musa kişi məhəbbət və ümid dolu nəzərlərlə ona* [Ayaza] *baxıb: "Düşmən toxmağıdır, Allah saxlasın!" – deyirdi.* M.İbrahimov; 2) *köhn.* qeyri müsəlmanlarla salamlaşma ifadəsi. **Allah tərəfi** – ədalətli, insaflı, vicdanlı, düz. [Qənbərqulu:] *Özü də* [babam] *çox rəhmdil və Allah tərəfi adam idi.* B.Talıblı. **Allah vursun** – narazılıq, şikayət, ikrah bildirir. **Allaha bax!** – xahiş, yalvarış. *Dilbərim, bari sən əğyar sözünə guş eyləmə; Bu qədər zülm eyləmə, xof eylə, bir Allaha bax!* Heyran xanım. **Allaha şükür** – yaxşı oldu ki, xoşbəxtlikdən. [Mirzə Heydər:] *Hacı, bağışlayınız, sizin Allaha şükür bir parça yeməyə çörəyiniz var, övrətiniz var...* Ə.Haqverdiyev. **Allahı sevərsən...** – xahiş, rica bildirir. **Allahın tənbəli** – çox tənbəl adam haqqında. **Allahın verən günü** – hər gün. *Allahın verən günü elə belə sübut eləyir.* N.Vəzirov. **Allahü-əkbər!** – əslən dini təbir olub, canlı dildə narazılıq, hiddət, acıq bildirən nida kimi işlənir. *Atamın anama acığı tutanda "Allahü-əkbər" deyirdi; anamın bizə acığı tutanda həmçinin "Allahü-əkbər" çığırırdı.* C.Məmmədquluzadə. [Balaş:] *Allahü-əkbər! Dilbər, mən onu demədim, mən söz-gəlişi deyirəm.* C.Cabbarlı. [Səfər bəy:] *Allahü-əkbər! Yenə də naqqallığına başladı.* B.Talıblı. **Allahü-əkbərin eşidilməyən yeri** – çox uzaq, çox ucqar, çox tənha, əlçatmayan yer. **Sən (siz) allah** – yalvarış, xahiş, rica bildirir. [Tafta:] [Sevil] *bu yaxın vaxtlar məni küçədə gördü, əllərini boynuma saldı, üzümdən öpdü, necə yalvarırdı ki, sən allah, uşağıma yaxşı bax.* C.Cabbarlı.

**ALLAHAXTARAN** b a x **allahaxtarıcı**.

**ALLAHAXTARICI** *is. tar.* Allahaxtarıcılıq tərəfdarı.

**ALLAHAXTARICILIQ** *is. tar.* 1905-ci il inqilabından sonra rus liberal ziyalıları arasında yayılmış dini-fəlsəfi cərəyan. *Allahaxtarıcılığın nümayəndələri.*

**ALLAHARAYICI** b a x **allahaxtarıcı**.

**ALLAHARAYICILIQ** b a x **allahaxtarıcılıq**.

**ALLAHQURUCU** *is. tar.* Allahquruculuq tərəfdarı. *Allahqurucuların məqsədi.*

**ALLAHQURUCULUQ** *is. tar.* 1905-ci il inqilabının məğlubiyyətindən sonra sosial-demokrat ziyalılar arasında yayılmış və yeni "sosialist" dini təbliğ etmiş dini-fəlsəfi, daha çox etik cərəyan.

**ALLAHLIQ** *is. məc. dan.* Hökmranlıq, hakimlik, özbaşınalıq. [Safo:] *Bu gödək adamlar da gündə üç dəfə allahlıq iddiasına düşürlər.* S.Rəhimov. ◻ **Allahlıq etmək** – hökmranlıq etmək, hökm sürmək, başlı-başınalıq etmək.

**ALLAHPAYI** *is.* Sədəqə. *Dilənçi qoltuğundakı köhnə paltarı ki, ona allahpayı vermişdilər, Nurəddinə geyindirdi.* S.S.Axundov.

**ALLAHPƏRƏST** *is.* [*ər.* Allah və *fars.* pərəst] Allaha inanan, Allaha sitayiş edən; dindar.

**ALLAHPƏRƏSTLİK** *is.* Allaha inanma, Allaha sitayiş etmə; dindarlıq.

**ALLAHSIZ** *sif.* və *is.* 1. Allaha, dini etiqadlara inanmayan, dinsiz. *Allahsızlar cəmiyyəti.*

2. *məc. dan.* İnsafsız, zalım, amansız (bəzən zarafat, bəzən də töhmət yerinə işlənir).

*Vermə ürəyi, əmanətindir! Allahsız ilə həyat çətindir!* Şəhriyar.

**ALLAHSIZLIQ** *is*. 1. Allaha, dini etiqadlara inanmama. *Allahsızlıq cəmiyyəti mənən ölümə məhkum edir. – Bəşər oğlu, heç üzünü tutma göylərə; Allahları üşütmədi allahsızlığın..* M.Araz.

2. *məc. dan.* İnsafsızlıq, zalımlıq. *Allahsızlıq baş alıb gedirdi.*

**ALLANMA** "Allanmaq"dan *f.is.*

**ALLANMAQ** *f.* Al rəngə boyanmaq, bəzənmək; al çiçək açmaq. // Qızarmaq, al rəng almaq. *Ağ alma allanıbdı; Ağacdan sallanıbdı; Mən sənə nə dedim ki; Gül üzün xallanıbdı?* (Bayatı). *Bəzəklənir, düzəklənir, bağın fəzası rənglənir; Yaşıllanır, həm allanır, şükufələr çiçəklənir.* A.Səhhət. *Çəmənlərarası yamyaşıl budaqların ara-bərəsindən uzun saplaqlı armudlar saralır, yupyumru almalar qızarıb allanırdı.* S.Rəhimov.

**ALLAŞDIRILMA** "Allaşdırılmaq"dan *f.is.*

**ALLAŞDIRILMAQ** *məch*. Al rəngə boyadılmaq, al hala salınmaq, qızardılmaq.

**ALLAŞDIRMA** "Allaşdırmaq"dan *f.is.*

**ALLAŞDIRMAQ** *f.* Al rəngə boyamaq, al etmək, qızartmaq.

**ALLEQORİK** *sif.* Alleqoriyalı, məcazi. *Alleqorik hekayə. Alleqorik şeir. Alleqorik təsvirlər. – Alleqorik xasiyyət daşıyan bu heykəllər xalq rifahının əməkdə, elmdə olduğunu ifadə edir.* M.İbrahimov.

**ALLEQÓRİYA** [*yun.*] 1. Hər hansı bir mücərrəd məfhumun, fikrin, ideyanın konkret bədii surətdə əyani ifadəsi (ədəbiyyatda, heykəltəraşlıqda, rəssamlıqda). *Orta əsr Şərq ədəbiyyatında alleqoriya mühüm yer tutmuşdur.*

2. Rəmz, kinayə, təşxis, məcaz.

**ALLÉQRO** [*ital.*] *mus.* 1. Tez, iti, cəld (musiqi əsərinin ifasının tempi haqqında).

2. Bu tempdə ifa edilən musiqi əsəri və ya onun bir hissəsi. *Əvvəllərdə yalnız iti sürətlə yazıldığına görə buna həm də sonata alleqrosu deyilir.* Ə.Bədəlbəyli.

**ALLERGİYA** *is.* [*yun.*] 1. Orqanizmin bəzi şeylərə həssaslığı nəticəsində korlanması xəstəliyi. *Allergiya xəstəliklərinin başvermə səbəbləri.*

2. *məc.* Müəyyən hadisə və ya şeydən xoşlanmamaq, narahat olmaq.

**ALLI** *sif. köhn.* Al rəngli paltar geymiş. *Tərifli gözəllər gəlhagəl oldu; Yaşıllı, zərbaflı, allı Sənəm, gəl!* Xəstə Qasım.

**ALLI-ƏLVANLI** *sif.* Al-əlvan. *Açılın iyli güllərim, açılın! Allı-əlvanlı güllərim, açılın!* A.Səhhət. *Allı-əlvanlı* (z.) *bəzənmiş qızlar, gəlinlər əllərində həna, gözlərində sürmə, qaşlarında vəsmə, şad və xürrəm hər kəs özünə görə kosaya pay verərdilər.* H.Sarabski.

**ALLI-GÜLLÜ** *sif.* Gözəl, qəşəng, bəzəkli, ala-bəzək, güllü-çiçəkli. *Gələcəkdir babam mənim yanıma; Baxacaq allı-güllü bostanıma.* A.Səhhət. *Dostum, sirdaşımdır allı-güllü bahar*. O.Sarıvəlli.

**ALLIQ** *is*. Al rəngli şeyin halı; qırmızılıq. *Bu allıqda gül olmaz. – Geniş payız meşəsi bir allığa və rəngarəng sarılığa boyanırdı.* S.Rəhimov.

**ALLI-ŞALLI** *sif. məh.* Al-əlvan. *Pətəklərdən və bağçada qoyulan qırmızı rəngli yeşiklərdən arılar dəstə-dəstə çıxır, geniş, yaşıl meşələrdə, allı-şallı çəmənlərə axır, dərələrə yayılır, şəhd toplayır və qayıdırdılar.* S.Rəhimov.

**ALLİTERÁSİYA** *is.* [*lat.*] *dilç.* 1. Avaz yaratmaq məqsədilə eyni səsin təkrar edilməsi (məs.: əldən qalan əlli il qalar.).

2. Şeirdə bədii vasitələrdən biri. *Alliterasiya Azərbaycan poeziyası və xalq ədəbiyyatında geniş yayılmışdır.*

**ALLÓ** [*ing.*] Telefonla danışarkən "qulaq asıram", "qulaq asın" – mənasında işlənən nida. *Allo, Bakımıdır? – deyir Talıstan; Yaşasın gələcək! Yaşasın insan!* S.Vurğun.

**ALMÁ¹** *is.* Müxtəlif çeşidləri və müxtəlif rənglərdə olan girdə, yaxud uzunsov meyvə. *Alma öz ağacından uzağa düşməz*. (Ata. sözü). ☐ **Alma kimi** – qıpqırmızı. [Gəlinin] *yanaqları alma kimi qızarmışdı.* Çəmənzəminli.

**ÁLMA²** "Almaq"dan *f.is.*

**ALMA-ARMUDLUQ** *is.* Alma və armud bağı, alma və armud ağacları əkilmiş yer. *Binanı əhatə edən bağ alma-armudluqdan, gilənarlıqdan ibarət idi.* S.Rəhimov.

**ALMACIQ** *is.* Gözlərin altında, üst çənənin üstündəki çıxıq, yanaq sümüklərinin dik yeri. *Almacıq sümükləri. – ..Salavat Movlayev qarayanız, enlisifət, almacıq sümük-*

*ləri çıxıq, orta yaşlı kosa bir adam idi.* Ə.Əbülhəsən.

**ALMAÇI** *is. dan.* 1. Alma mütəxəssisi, alma tanıyan adam.

2. *köhn.* Alma alverçisi.

**ALMAGÜVƏSİ** *is. zool.* Alma ağaclarına ziyan verən bir cücü. *Almagüvəsi ilə aqrotexniki, bioloji və kimyəvi üsullarla mübarizə aparılır.*

**ALMAQ** *f.* 1. Əlinə götürmək, əl ilə tutub götürmək, qaldırmaq. *Əlinə ağac almaq. Qələmi əlinə aldı və yazdı. Tüfəngini alıb ova getdi. – Aqil böyüklərə məxsus bir ədəblə çəngəl-bıçaq almış, çörəyini-xörəyini qabağına çəkmişdi.* Mir Cəlal. // Cəld qapmaq, tutmaq, ələ keçirmək; ovlamaq. *Qızılquşlar ov kimi süzüb, qırqovulları göydə alıb, otluğa endilər.* Çəmənzəminli.

2. İcra üçün qəbul etmək. *Tapşırıq almaq. Sifariş almaq. Komanda almaq. Siqnal almaq.*

3. Satın almaq. *Bazardan ət almaq. Mağazadan palto aldım. – Bahadır mahud almaq fikri ilə bir mağazaya varid oldu.* N.Nərimanov. *Salam kişi* [Aqilə] *çoxlu dəftər, rəngli qələm alacağını vəd etdi.* Mir Cəlal.

4. Qaldırmaq, götürmək, çıxarmaq, açmaq. *Sevdiyim alaydı üzündən niqab; Bir də baxıb o camalı görəydim.* M.P.Vaqif.

5. Əxz etmək, götürmək, istifadə etmək. *Məlumatı ilk məxəzlərdən almışam. Müəllif mövzunu xalq həyatından almışdır.*

6. Göndərilən, verilən, təklif edilən, gözlənilən, istənilən bir şeyi qəbul etmək, götürmək, əldə etmək. *Məktubu almaq. Maaş almaq. Yeni evdə mənzil almaq. Tibbi yardım almaq. Üzərinə vəzifə almaq.* – [Qüdrət:] *Gəmi vermirlər? Almaq lazımdır. Almağı bacarmaq lazımdır.* M.Hüseyn.

7. Rütbə, ad, dərəcə, vəzifə sahibi olmaq, qazanmaq. *Professor adı almaq. Elmlər namizədi elmi dərəcəsi almaq.*

8. Özü ilə bərabər gətirmək, özü ilə aparmaq, yanınca gətirmək. [Rəşid:] *Çox təvəqqe edirəm ki, Nina xanımı da alıb bizə təşrif gətirəsiniz.* M.S.Ordubadi. *Hər gün şamdan sonra atam məni yanına alıb, çərəkədən mənə dərs deməyə başladı.* M.İbrahimov. // Aparmaq, götürmək, gətirmək. [Qızılquş] *ovladığı quşu su kənarına alar, tüklərini yolar, cəmdəyini suda təmiz yaxaladıqdan sonra parçalayıb balalarının qabağına atar.* A.Şaiq.

9. Ələ keçirmək, fəth etmək, istila etmək, tutmaq, özünə tabe etmək. *Şəhərlər almaq. Əsir almaq. Qalanı almaq.*

10. Zəbt etmək, əlinə keçirmək, tutmaq, ixtiyarına keçirmək. [Qubernator:] *Budur, Əmiraslan bəy deyir: müsəlmanların yerlərini alırlar, heç hələ özündən xəbəri yoxdur.* C.Cabbarlı.

11. Evlənmək, özünə arvad etmək. [Vəzir:] *Mən sənin baldızın Nisə xanıma təəşşüq yetirib onu almağa talib idim.* M.F.Axundzadə. [Nəcəfqulu:] *..Mahmud, indi zamana xarab olub, qızı görməmiş heç kəs almaq istəməyir.* B.Talıblı.

12. Bürümək, qaplamaq, əhatə etmək, basmaq, sarmaq, örtmək. *Dağların başını duman almışdır. – Çən alıb dağlar başın; Bağ başın, bağlar başın; Camalın bir aynadır; Hər görən bağlar başın.* (Bayatı).

13. Yemək, içmək, dadmaq. *Kababdan bir-iki tikə aldım. Bir udum su aldım.*

14. İstehsal etmək, hasil etmək, hazırlamaq. *Neftdən benzin alırlar. Daş kömürdən müxtəlif maddələr almaq olur. Tədqiqatdan maraqlı nəticələr almaq.*

15. Daxil etmək, iştiraka yol vermək. *Aralarına almaq. Sahibsiz uşaqları uşaq evinə aldılar.*

16. Müəyyən bir şəklə düşmək, mahiyyət kəsb etmək. *Mübahisə çox kəskin bir şəkil aldı. Yağış adi bir hal almışdır. Onların söhbəti başqa bir rəng aldı. – İndi siyasət dünyası tufanlı bir dərya halını almaqdadır.* M.İbrahimov.

17. Kəsmək, gödəltmək, qısaltmaq, kiçiltmək. *Ağac uzundur, bir az boyundan almaq lazımdır. Paltonun ətəyindən bir az alsan, pis olmaz. Saçların yan-yörəsini almaq.*

18. Anlamaq, düşünmək, dərk etmək. *Mən onun danışığından bir şey ala bilmədim. Zehnim bunu almır.*

19. Çıxartmaq, götürmək. *Doqquz yaşı olanda anası onu* [Azadı] *oxuda bilməyib, məktəbdən aldı.* M.İbrahimov.

20. Məşğul etmək, maraqlandırmaq, diqqətini cəlb etmək, həyəcanlandırmaq. [Tağının] *bacısını xan .. aparandan sonra, evdə qalmış balaca qardaşının qeydi onu alıbdır.* Ə.Haqverdiyev. *Qəribə bir xatirə məni aldı.* M.İbrahimov.

21. *məc. dan.* Təsir etmək, əsər etmək. *Bu söz məni aldı.*

22. Çalışaraq əldə etmək, rabitə yaratmaq. *Nə qədər zəng etdimsə, istədiyim nömrəni ala bilmədim. – Birdən* [Dəmirov] *ara verdi, zəng edib Qiyasəddinovu aldı.* S.Rəhimov.

23. Məhrum etmək. *Aşıq ala gözlərin; Canım ala gözlərin; Qorxuram düşəm öləm; Yada qala gözlərin.* (Bayatı). *Alıbsan əlimdən din-imanımı; Müştaq eləyibsən ay üzə-üzə.* Aşıq Ələsgər.

24. Sərf etməyə məcbur etmək, aparmaq. *Bu iş iki gün vaxtımı aldı.*

25. *məc. dan.* Rüşvətxor olmaq, rüşvət qəbul etmək. [Səfər bəy:] *Deyirlər ki, bizim hakim almayır.* (*Barmağı ilə rüşvətə işarə eləyir*). B.Talıblı.

26. Bir sıra isimlərdən sonra gətirilərək, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: önünü almaq, söz almaq, intiqam almaq, qan almaq, könlünü almaq və s.

**ALMALIQ**[1] *is.* Alma bağı, alma ağacları əkilən yer. *Onlar gəlib almalığa çatdılar. Qırmızı ətirli almaları gördükdə, Qaraca qızın gözləri parladı.* S.S.Axundov.

**ALMALIQ**[2] *is.* Atların gözlərinin üst tərəfindəki çuxur yer, çökəklik.

**ALMAN** *is.* Almaniyanın əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam. *Alman ədəbiyyatının qədim abidələri. Klassik alman fəlsəfəsi.*

**ALMANÁX** [*ər.* "əlmənah" sözündən] Müxtəlif yazıçıların əsərlərindən ibarət qeyri-dövri məcmuə. *Ədəbiyyat almanaxı. – .."İncəsənət" almanaxının üçüncü nömrəsi çapa hazırlanmışdır.* (Qəzetlərdən).

**ALMANCA** *zərf* və *sif.* Alman dilində. *Almanca danışmaq. Almanca dərslik.*

**ALMANPƏRƏST** *is.* Almanlara, alman adət və mədəniyyətinə pərəstiş edən adam.

**ALMANPƏRƏSTLİK** *is.* Almanlara, alman mədəniyyət və adətlərinə pərəstiş etmə.

**ALMAYANAQ** *sif.* 1. Yanaqları qırmızı; alyanaq. *Almayanaq qız.*

2. Almacıq sümükləri çıxıq. *Almayanaq monqollar; Yel qanadlı atlarla aşdılar; Tibet çölünü.* R.Rza.

**ALMAZ** *is.* 1. Son dərəcə bərk, rəngsiz, şəffaf qiymətli daş (xüsusi şəkildə taraşlanmış almaz brilyant adlanır). *Almaz kimi şəffaf.* – [Hacı Murad:] *Pəh, pəh, pəh, .. almazların şəfəqi gözlərimi qamaşdırır.* S.S.Axundov. *..İncə almazlarla süslənmiş bir cib saatını götürüb çıxdım.* M.S.Ordubadi.

2. Həmin daşdan bir qırıq keçirilmiş şüşəkəsən alət. *Şüşəsalanın almazı kütləşmişdir.*

3. *Sif. mənasında.* Həmin daşdan hazırlanmış və ya bu daşla bəzənmiş. *Üzüyün almaz qaşı.*

4. Xüsusi təşbihlərdə – şəffaflıq, saflıq, parlaqlıq mənasında. *Günəş ziyasında qılarkən nəzər; Almaz kimi parıldayır qətrələr.* A.Səhhət. *Hər sözü bir ulduz, bir şəffaf almaz; Mənalar dünyası qaranlıq deyil.* S.Vurğun. *Almaz kimi şeh düşür bağçalara, bağlara.* M.Seyidzadə.

**ALMAZI** *sif.* Almaz kimi şəffaf; duru, təmiz. *Ədalət gözlərindən almazı yaşlar tökərək başıaşağı dərəyə qaçırdı.* Mir Cəlal.

**ALNIAÇIQ** *sif.* Vicdanı təmiz, utanılacaq işi olmayan, namuslu. *İlk baharın sevincilə xumarlanan gözəl səhər; Min zəfərlə qarşılayır alnıaçıq ordumuzu.* S.Vurğun. [Kərim bəy:] [Nəriman], *o gün olsun ki, sağ-salamat, alnıaçıq* (z.) *qayıt gəl, baban sənə çox borcludur.* Mir Cəlal.

**ALOV** *is.* Yanan bir şeydən çıxan od. *Tonqalın alovu uzaqdan görünür. Yanğının alovu hər tərəfi işıqlandırır. – Qığılcımdan alov törər.* (Məsəl). *Hər tərəfdən od yağırdı, alov və tüstü çıxırdı.* M.İbrahimov. *Alovdan səmayə çəkilir hasar; Hər addım başında bir təhlükə var.* M.Rahim. // Məc. mənada. *Müharibə alovu. Məhəbbət alovu.* – [Mirzə:] *Xeyr, bəy, ciyər yananda nəfəs əvəzinə alov çıxar.* Ə.Haqverdiyev. *Alovlar dağıdan xoş nəfəsindən; Hər əsgər qəlbinə min qüvvət axdı.* S.Vurğun. *Hamının üzündə nifrət alovu yanırdı.* M.Hüseyn.

**ALOVGÖZLÜ** *sif.* Gözlərindən alov saçan, qızğın, ehtiraslı. // Məc. mənada. *Mən gu-*

*rultu qoparmağı ilk öncə; Alovgözlü şimşəklərdən öyrəndim.* M.Müşfiq.

**ALOVLANDIRILMAQ** *məch.* 1. Yandırılmaq, alışdırılmaq, alov çıxarılmaq.

2. *məc*. Qızışdırılmaq, şiddətləndirilmək, gücləndirilmək.

**ALOVLANDIRMA** “Alovlandırmaq”dan *f.is.*

**ALOVLANDIRMAQ** *f.* 1. Yandırmaq, alışdırmaq, tutuşdurmaq, alov çıxartmaq. *Tonqalı alovlandırmaq. Külək yanğını daha da alovlandırdı.*

2. *məc*. Daha da şiddətləndirmək, qızışdırmaq, gücləndirmək. *Düşmənin vəhşiliyi ona qarşı olan kin və nifrəti daha da alovlandırdı.* // Bərk hirsləndirmək, qəzəbləndirmək.

**ALOVLANMA** “Alovlanmaq”dan *f.is.*

**ALOVLANMAQ** *f.* 1. Bərk yanmaq, alışmaq, tutuşmaq, alışıb-yanmaq. *İldırım vurmuş taya dərhal alovlandı.*

2. *məc.* Qızarmaq, işıqlanmaq, parlamaq. *Dan yeri alovlandı. – Yenə od tutdu, dan yeri yandı; Şölələndi, üfüq alovlandı*. A.Səhhət. *Bəzi naxışlar sanki alovlanıb yanır və parlaq tayların zolaqları ilə pəncərəyə doğru uçuşurdu*. Çəmənzəminli.

3. *məc.* Şiddətlənmək, qızışmaq, güclənmək. *Müharibə alovlandı. – Əz düşməni, qır düşməni zamandır; Gözlərində alovlansın qəzəb, kin*. S.Rüstəm.

**ALOVLATMAQ** b a x **alovlandırmaq** 1-ci mənada.

**ALOVLU** *sif.* 1. Şiddətlə yanan, parlayan, alov çıxan.

2. *məc. tənt.* Hərarətli, atəşin, ehtiraslı, coşqun. *Alovlu salamlar. Alovlu nitq. Alovlu sözlər. Alovlu baxışlar.* // Hiddətdən qıpqırmızı olmuş. *Bu halda* [Toğrulun] *alovlu gözləri Rəşid kişinin qan çanağına dönmüş gözlərinə sataşdı.* H.Nəzərli. // *məc.* Yandırıcı, yaxıcı. *Dağ başında ov budur; Çaxmaq budur, qov budur; Sevgi od deyil yana; Oddan da alovludur.* (Bayatı).

**ALOVLULUQ** *is.* Ehtiraslılıq, qızğınlıq, coşqunluq, hərarətlilik.

**ALOVSAÇAN** *sif.* Odsaçan, od püskürən, atəşin, alovlu; hərarətli, qızğın.

**ALP** *is.* və s. *qəd.* Qədim türk ordusunda xüsusi zümrə təşkil edən adamların yalnız qılınc və qan bahasına qazanaraq aldıqları titul. *Alp ərə qorxu vermək eyib olur.* “Dədə Qorqud”.

**ALPİNİ́ST** [*xüs. is.*-dən] Alpinizm ilə məşğul olan adam, dağ turisti. *İlk alpinist klubları.*

**ALPİNİ́ZM** [Alp dağları adından] Dağ turizmi; uca dağların təpəsinə, buzlaqlara çıxmaqdan ibarət idman növü. *Alpinizm tədbirlərinin təşkili. Beynəlxalq Alpinizm Assosiasiyası İttifaqı. Alpinizmdə xüsusi ləvazimatdan istifadə olunur.*

**ALT** *is.* 1. Bir şeyin aşağı hissəsi, üstünün əks tərəfi, səth üzərinə qoyulan tərəfi. *Qənddanın altı. Dibçəyin altı. Qutunun altı. Çəlləyin altı qopdu.* // Örtülü bir şeyin üst tərəfinin əksi, aşağısındakı yer. *Damın altı. Talvarın altı. Ağacın altında kölgələnmək. – Çardaq altında sağılan heyvanların kəsik-kəsik mələmələri .. eşidilirdi*. Ə.Əbülhəsən. // Bir səthin üzərində şey duran hissəsi. *Səkinə kərpicin altına baxdı, açar orada yox idi*. Mir Cəlal. *Altın görmədiyin qabdan su içmə.* Məsəl.

2. Evin alt mərtəbəsi. *Evin üst mərtəbəsi yataqxana, altı isə mağazadır. İdarəmizin altı anbardır. Məktəbin altı emalatxanadır.* // *Sif. mənasında.* Altda, alt tərəfdə olan. *Alt mərtəbə. Şkafın alt gözü. – Alt otağın böyük qapısı cırıltı ilə açıldı.* Mir Cəlal. *Alt daşı ağır olar.* (Ata. sözü).

3. Bir şeyin səthindən aşağı tərəf. *Altımız dərə idi, üstümüz qarlı təpələr. Suyun altına düşmək. Dağın alt tərəfindəki evləri sel basmışdı.*

4. Bir adamın, heyvanın durduğu, yatdığı, oturduğu yer. *Altına döşək salmaq. – Hər səhər malların altını təmizləyib, su və yemlərini verdikdən sonra, mən həyətimizdəki peyinlikdə cələ qurardım*. M.İbrahimov.

5. Bilavasitə yaxınlıq mənasında işlənir. *Volqoqrad altında işğalçı alman ordularına zərbələr vuran qəhrəman. – Artıq .. kənd altından maral sürüləri keçib dağlara qalxmır.* Ə.Məmmədxanlı.

6. Bir şeyin təsir dairəsini göstərir. *Əsgərlərimiz düşmənin gülləsi altında irəliləyirdi. Top atəşi altına düşmək. Yağış altında yerimək. – Günün altında dayanmaq mümkün deyildi.* M.İbrahimov.

7. (Yalnız yönlük, yerlik və çıxışlıq hallarda). Bir şəxsin və ya şeyin düşdüyü və ya içərisində olduğu vəziyyəti, keyfiyyəti bildirir. *Himayəsi altına almaq. Təsir altına düşmək. Müdafiə altında olmaq. Rəhbərlik altında işləmək. Təhlükə altında olmaq. Həkimin nəzarəti altında müalicə. – Mən .. həyatı unudub onun təsirləri altından çıxa bilmirdim..* M.S.Ordubadi.

8. *Sif. mənasında.* Altdan geyilən. *Alt köynək. Alt tuman.*

◊ **Alt başında** – yanında. **Alt dan** – b a x **dan. Alt-alt(da), üst-üst(də)** – olduğu kimi; səliqəsiz, qarışıq bir halda. *O, müdir olduğu su idarəsinin işini alt-altda, üst-üstdə qoyub gəldi Rzaqulu kəndinə gedən yola.* **Altda qalmaq** – məğlub olmaq, basılmaq. *Altda qalan namərddir.* (Ata. sözü). *İndi ki quyruğun basdın ilanın; Canı çıxsın gərək altda qalanın.* Q.Zakir. **Altına almaq** – basmaq, məğlub etmək, basıb üstünə çıxmaq. *Tərlan, Məmmədağanın bir yanında bibisi oğlu Əyyubu basmarlayıb cücü kimi altına alıbdır.* S.S.Axundov. **Altından çıxmaq** – öhdəsindən gəlmək; ödəmək, əvəzini vermək. *Onlar bilmirdilər ki, bu qızıl pulun altından necə çıxsınlar.* "Qaçaq Nəbi". **Altını çəkmək** – peşman olmaq, tutduğu işin pis nəticəsini görmək. *Soyuq havada paltosuz gəzdi, indi altını çəkir.* – [Güləndam:] *Qız uşağının beyni olmaz. ..Sonra bir iş olar, altını çəkə bilməzsən.* N.Vəzirov.

**ALTAĞIZ** *is. zool.* Çəki balıqlarının çayların dibində yaşayan bir növü.

**ALTDAN** *zərf* 1. Aşağı tərəfdən, alt tərəfdən. *Altdan tutub qaldırmaq.*

2. *məc.* Gizli, xəlvəti. [Gədə:] *Mən onların altdan söydüyünü görmüşəm.* S.Rəhimov.

**altdan-altdan** *zərf* b a x **altdan** 2-ci mənada. [Nabat] *əlaltı özünə paltar tikdirirdi və altdan-altdan geyinib asta-asta sallanırdı.* S.Rəhimov. *Ailənin başqa üzvləri də sakit və altdan-altdan gah Şəmsiyyəyə, gah Səlimiyə baxır(dılar)..* M.İbrahimov. [Qara kişi] *altdan-altdan qarısına baxırdı.* Ə.Əbülhəsən.

**ALTDAN-ÜSTDƏN** *zərf* Yalan, düzgün olmayaraq. [Xan qəti bir səslə:] *Düzünü de görüm, necə oldu? – dedi, – bax, birini altdan-üstdən desən, başın cəllad əlindədir!* Çəmənzəminli.

**ALTDAN-YUXARI** *zərf* Aşağıdan-yuxarı. *Aqil altdan-yuxarı Həbibin üzünə baxdı.* Ə.Vəliyev.

**ALTERÁSİYA** [*lat.*] *mus.* Musiqi kökündə əsas səsin yarım ton, yaxud bütöv ton zilləşdirilməsi (yüksəldilməsi) ya da, əksinə, bəmləşdirilməsi (aşağı salınması). *Alterasiya işarələri. – ..Artırılmış sekunda, triton orta tonlarının alterasiya edilməsi yolu ilə üç bütöv ton ardıcıllığının pozulması nəticəsində əmələ gəlir.* Ü.Hacıbəyov.

**ALTERNATÍV** *is.* [*fr.*] 1. Bir-birini istisna edən imkanlardan hər biri.

2. Bir-birini istisna edən imkanlardan birini seçmə. *Alternativ öhdəlik.*

**ALTI** *miqd. s.* Beşdən sonra gələn ədəd – 6.

**altı-altı** *zərf* Hər birinə, yaxud hər dəfəsinə altı. *Dəftərləri altı-altı ayırmaq. Əsgərlər altı-altı sıraya düzüldülər.*

**ALTIAÇIQ** 1. *sif.* Alt tərəfi açıq olan.

2. *is. məh.* Talvar.

**ALTIAÇILAN** *is. dan.* Çaxmağı ilə lüləsi arasında altı güllə tutan, hərlənən topu olan tapança.

**ALTIAVARLI** *sif.* Üç cüt avarı olan. *Altıavarlı qayıq.*

**ALTIAYLIQ** *sif.* 1. Altı ay, yarım il davam edən və ya davam etmiş. *Altıaylıq hesabat. Altıaylıq bir dövr. Altıaylıq möhlət. Məsələnin altıaylıq bir tarixi var.*

2. Yaşı altı ay olan, yarımillik. *Altıaylıq uşaq. Altıaylıq buzov.*

3. Altıaylıqda doğulmuş (uşaq).

**ALTIBARMAQ** *sif.* Əlində və ya ayağında altı barmaq olan.

**ALTIBAŞLI** *sif.* Altı təpəsi, ucu, başı olan. *Altıbaşlı dağ. Altıbaşlı ağac.*

**ALTIBUCAQ** *is. hənd.* Altı bucağı olan cisim.

**ALTIBUCAQLI** *sif.* Altı bucağı olan. Altıbucaqlı cisim.

**ALTICƏHƏT** *sif.* Altıtərəfli, altı tərəfi olan.

**ALTICƏRGƏLİ** *sif.* Altı cərgə (sıra) şəklində olan, altı sıra şəklində düzülmüş, altı cərgədən ibarət olan. *Altıcərgəli əkin.*

**ALTIDÜYMƏ** *sif. dan.* Ölçüsü altı düymə olan. *Altıdüymə taxta. Altıdüymə mıx.*

**ALTIGÜLLÜK** *is. məh.* Yer altında yuva tikən göy rəngli bir quş.

**ALTIGÜNLÜK** 1. *sif.* Altı gün sürən və ya sürmüş. *Altıgünlük müddət. Altıgünlük səyahət.*

2. *is.* Altı gündən ibarət müddət. *Aprelin birinci altıgünlüyü. Altıgünlüyün birinci günü.*

**ALTIQATLI** *sif.* 1. Altı mərtəbəsi olan. *Altıqatlı ev. Altıqatlı şkaf.*

2. Altı qatı, altı layı olan. *Altıqatlı karton. Altıqatlı mədən yatağı. Altıqatlı faner.*

**ALTILIQ** 1. *sif.* Ölçüsü (eni, hündürlüyü, qalınlığı) altı düymə (və s.) olan. *Altılıq taxta. Altılıq mismar.*

2. *is.* Oyun kağızlarında altı xalı olan vərəq, yaxud altı nömrəli şey. *Altılıq kart.*

**ALTIMANATLIQ** *sif.* Altı manata dəyən; qiyməti altı manat olan. *Altımanatlıq parça. Altımanatlıq köynək.*

**ALTIMƏRTƏBƏ(Lİ)** *sif.* Hündürlüyü altı mərtəbə olan, altıqatlı. *Altımərtəbə*(*li*) *ev.* – *Nəhayət, trest altımərtəbəli yaşayış evinin üstündə durmuşdu.* M.İbrahimov.

**ALTINCI** *sıra s.* Sıra ilə beşincidən sonra gələn ədəd. *Altıncı sinif. Altıncı sıra. Həftənin altıncı günü* (*şənbə*). – *Nəriman ilk cərgədən altıncı adam idi. Qabaqda dayanmağından məmnun idi.* Mir Cəlal.

**ALTISAATLIQ** *sif.* Altı saat sürmüş və ya sürən; altı saat vaxt tələb edən. *Altısaatlıq iş günü. Altısaatlıq yol.*

**ALTITARLALI** *sif. k.t.* Altı ildən bir dövr edən (əkin dəyişmə). *Altıtarlalı təsərrüfat. Altıtarlalı əkin.*

**ALTIÜZLÜ** *sif. hənd.* Altı üzü olan həndəsi cisim.

**ALTIYANLI** b a x **altıüzlü.**

**ALTIYAŞAR** *sif.* Altı yaşında olan. *Altıyaşar uşaq*.

**ALTIYAŞLI** *sif.* Yaşı altı olan. *Altıyaşlı Ədalət də iş görür, kömək edirdi.* Mir Cəlal.

**ALTLIQ** *is.* 1. Bir şeyi saxlamaq üçün onun altına qoyulan şey, dayaq və s. *Dibçək altlığı.*

2. Bünövrə, əsas, dayaq, bir şeyin aşağı hissəsi, altı. *Heykəlin altlığı. Abidənin altlığı mərmərdəndir.*

3. Ayaqqabının altına vurulan dəri, rezin və s. *Əvvəllər ayaqqabının altlığı əl ilə vurulurdu.*

**ALTMIŞ** *miqd. s.* Altı onluq; əlli doqquzdan sonra gələn ədəd – 60. *Əllisində əlif qəddin bükülər; Altmışında ön dişlərin tökülər..* "Koroğlu". *Altmış illik ömrüm oldu səndə bərbad, Ərdəbil.* M.Ə.Sabir.

**ALTMIŞINCI** *sıra s.* Sıra ilə əlli doqquzuncudan sonra gələn ədəd. *Altmışıncı illər. Altmışıncı səhifə. Altmışıncı ildönümü.*

**ALTMIŞLIQ** *sif.* Altmış yaşlı, altmış yaşında. *Yamaqlı çarşabı altından altmışlıq bir qadın yaşıl damarları çıxmış gəmik əli ilə bir kağız parçasını uzadaraq: – Oğul, al bu kağızı oxu, gör kimə veriləcək? – dedi.* A.Şaiq.

**ÁLTO** [*ital.*] *mus.* 1. Xor, yaxud vokal ansambllarında bəm qadın və ya uşaq səsləri ilə ifa olunan partiya. // Bu səslə oxuyan adam.

2. Skripkaya oxşar, lakin ondan bir qədər böyük, 4 simli musiqi aləti. // Alçaqsəsli nəfəslə çalınan musiqi aləti.

**ALTRUÍZM** [*fr.*] Başqasının naminə, təmənnasız olaraq, öz mənafeyini qurban verməkdən ibarət əxlaqi prinsip. *Altruizm prinsipinin mənşəyi Qədim Şərqin əxlaq haqqındakı təsəvvürləri ilə bağlıdır.*

**ALTUN** *is.* Qızıl. *Sənə gülşəndə nisar etmək üçün, hər nərgis; Götürübdür başa altun dolu bir sim təbəq.* Füzuli. [Aydın:] *Dünyada hakim bir qüvvət varsa, o da altun, yenə altundur.* C.Cabbarlı. *Payız günəşi ətrafındakı kolların seyrək yarpaqlarını altun təbəqələri kimi parlatmaqda idi.* H.Nəzərli.

**ALT-ÜST** *zərf* Qarmaqarışıq, pozğun, nizamsız, bərbad bir halda. *Gəldim bütün kağızlarımı alt-üst gördüm.* ◻ **Altını üstünə çevirmək** – b a x **alt-üst etmək (eləmək)** 1-ci mənada. *Gecə yarısı* [qorodovoylar] *Feyzullanın arvadını, uşaqlarını ürəkqopma azarına salıb, evin altını üstünə çevirdirlər.* Ə.Haqverdiyev. **Altını-üstünü ölçmək** – dolaşmaq, gəzmək, çox gəzib gəlmək. *Zurnaçılardan tutmuş traktor sürənə qədər hamı yolun altını-üstünü ölçürdü.* M.Hüseyn. **Alt-üst etmək (eləmək)** – 1) dağıtmaq, qarışdırmaq, bərbad etmək, darmadağın

etmək. *Jandarmlar .. otağı alt-üst etməyə başladılar.* M.S.Ordubadi. *Nə buldular İskəndərlər, Çingizlər; Cahanı titrədib alt-üst etdilər.* H.Cavid; 2) puça çıxarmaq, heçə çıxarmaq, pozmaq. *Tubunun səsindəki mülayimlik Umudun bayaqkı şübhələrini bir andaca alt-üst elədi.* İ.Məlikzadə. **Alt-üst ilə** – artıraraq, çevirərək, dəyişdirərək, başqa şəkildə. [Ağca xanım] *corabçıdan eşitdiklərini bir az da alt-üst ilə Gəldiyevə danışır.* Mir Cəlal. **Alt-üst olmaq** – 1) altı-üstünə çevrilmək, dağılmaq, qarışmaq, bərbad olmaq, darmadağın olmaq; 2) puça çıxmaq, heçə çıxmaq, pozulmaq. *Bütün arzularım alt-üst oldu. – Həyatdan bezmiş, bütün ümidləri alt-üst olmuş Gülyazın heç bir çıxış yolu qalmamışdı.* M.Hüseyn. *Ayağım yekə bir daşa toxundu, bütün fikirlərim alt-üst oldu.* Ə.Vəliyev.

**ALU** [*fars.*] b a x **alı**. *Dedi: "Meylin olurmu aluyə; Təmi meyxoş qızıl gavaluyə?"* M.Ə.Sabir.

**ALUDƏ** [*fars.*] Tutulmuş, mübtəla; vurulmuş, məftun. *Biz ol aludeyi-dərdik ki, cami-mey dəvamızdır.* S.Ə.Şirvani. □ **Aludə olmaq** – 1) tutulmaq, mübtəla olmaq, qapılmaq, başı qızışmaq. *Oğlan oyuna bir mərtəbədə aludə olmuşdu ki, gecə vaqiədə də oyundan sayaqlardı.* Ə.Haqverdiyev. [Firidun] *düşüncələrinə o qədər aludə olmuşdu ki, günorta yerində durmuş və hər şeyi yandıran günəşin istisini belə hiss etmirdi.* M.İbrahimov; 2) vurulmaq, məftun olmaq. *Aludeyi-qəddü rüxü çeşmin ola aşiq; Sərvü səmənə, nərgisi-şəhlaya baxarmı?* Q.Zakir. *Nəriman uzaqdan-uzağa bu qıza elə aludə oldu ki, pəncərə günlər ilə örtülmədi.* Mir Cəlal.

**ALUDƏLİK** *is.* 1. Bir şeyə aludə olmuş adamın halı; mübtəlalıq.

2. Böyük həvəs, şövq. *Firidun ədəbi əsərləri atəşin bir aludəliklə* (z.) *təhlil edərdi.* M.İbrahimov. *Mədəd .. böyük bir səylə və aludəliklə məktubun axırıncı cümlələrini yazırdı.* Ə.Əbülhəsən.

**ALUNİ́T** [*fr.*] *miner.* Zəy daşı. *Daşkəsən yaxınlığında olan Zəylik alunit yatağının çox böyük əhəmiyyəti vardır.* M.Qaşqay.

**ALÜMİN** [*lat.*] Alüminiumdan qayrılmış. *Alümin qazan. Alümin qaşıq. – Yarır təyyarəmizin alümin qanadları; Hava dalğalarını, gərib sinə sərt yelə.* S.Rüstəm.

**ALÜMİ́NİUM** *is.* [*lat.*] *kim.* Çəkic altında asan döyülüb yayıla bilən gümüş rəngli yüngül metal. *Alüminium ancaq birləşmələr şəklində tapılır. Kimyəvi elementlərdən isə alüminium, volfram, nikel, kobalt, qurğuşun və radioaktiv metalların yeni yataqlarının axtarışı xüsusi əhəmiyyət kəsb edir.* M.Qaşqay.

**ALÜMİNİUMLU** *sif. kim.* Tərkibində alüminium olan. *Alüminiumlu ərintilər.*

**ALVER** *is.* Alğı-satqı, ticarət. *Xırda alver. Alverlə mübarizə. Alver etmək.*

**ALVERÇİ** *is.* Alış-verişlə, alverlə, mal alıb-satmaqla məşğul olan adam; alverçiliyi özünə peşə etmiş adam; ehtikarçı. *Burası* [Tehranda bir döngə] *xırda alverçilərin və bazar alverçilərinin dolandığı yer idi.* M.İbrahimov.

**ALVERÇİLİK** *is.* Alverlə məşğul olma, alver işi. *Quluda alverçilik damarı vardı.* A.Şaiq.

**ALYANAQ(LI)** *sif.* Yanaqları qırmızı. *Alyanaq uşaq. – Alagözlü, alyanaqlı qız utanaraq qumral saçlarını üzünə örtüb, ürkmüş maral kimi evə qayıdır.* H.Sarabski.

**AL-YAŞIL** *is. köhn.* Al-yaşıl rəngli ipək parça. *Əziziyəm bizə gəl; Al-yaşıl gey, bizə gəl.* (Bayatı). [Heydər bəy:] *Amma buranın xalqı belə firəng çitinə hərisdir ki, onu görəndə al-yaşılın üzünə baxmırlar.* M.F.Axundzadə.

**AM** *is.* [*ər.* "əvam" söz. təki] Adi xalq kütləsi, adi camaat, adi adamlar (*xas* ziddi). *Bəzm əhlinə növbət ilə ver cam; Həm xas riayət eylə, həm am!* Füzuli. *Bəsdir daha tənqid elədin xas ilə amı; Çox yazma, danışma, daha tul etmə kəlamı*. C.Cabbarlı.

**AMAC** *is.* [*fars.*] *klas.* Nişanə, hədəf, nişangah. *Kim, İbni-Səlami etdi gərdun; Amaci-xədəngi-ahi-Məcnun.* Füzuli. *Amacisinəmi növgi-mujganın; Qoyub nişanəyə gözlər, nə gözlər!* Nəbati. *Mən demədimmi sənə, başda otur tac tək; Durma müqabil bəla tirinə amac tək.* M.Ə.Sabir.

**AMADƏ** *zərf* [*fars.*] Hazır, hazırlanmış, müntəzir. *Keçən şəb bir məkanda bir nigarisadə gördüm mən; Xədəngi-qəmzəsin can almağa amadə gördüm mən.* S.Ə.Şirvani.

*Ovçu Pirim oğlu Camal xanın çıxmayacağını görüb, evi tamamilə oda tutmuşdu və əlində tüfəng amadə dayanmışdı.* S.Rəhimov. ☐ **Amadə olmaq** – hazır olmaq. *Verdin keçən il borcuna yorğanını, neylim; Ol indi palaz satmağa amadə, əkinçi!* M.Ə.Sabir. [Səlimi:] *Mənim fikrim yavaş-yavaş kiçik bir dəstə hazırlamaqdır. Amadə olmaq lazımdır.* M.İbrahimov.

**AMADƏLİK** *is*. Hazırlıq, hazır vəziyyət, müntəzirlik. *Üç-dörd günün müddətində hamı müntəxib olunan kəslər göründü və hamısı şurişə meyil və amadəlik göstərirdilər.* M.F.Axundzadə.

**AMAL** *is*. [*ər.* "əməl" söz. cəmi] *tənt.* Qayə, məqsəd, arzu, ümid, dilək. *Mən gedərsəm, var olsun amalım! Yaşasın şəhriyari-hürriyyət!* M.Ə.Sabir. *And içək ki, ölüm bizi Azərbaycanın səadəti yolundan, böyük amalımız yolundan döndərə bilməz!* M.İbrahimov.

**AMALQÁMA** [*fr.* əsli ərəbcədən] *kim*. Bəzi metalların civə ilə əmələ gətirdiyi ərinti, xəlitə. *Amalqama maye yarımmaye və ya bərk halda ola bilər.*

**AMAN** *is*. [*ər.*] 1. Əmin-amanlıq, əmniyyət, təhlükəsizlik, qorxusuzluq, dinclik.

2. Möhlət, macal, imkan. ☐ **Aman vermək** – macal vermək, imkan vermək, vaxt vermək, rahat buraxmaq. [Molla İbrahim Xəlil:] *Gümüş xahiş edənlər bir mərtəbədə çoxdur ki, hətta mənə aman vermirlər ki, iksirin müddəti-təkmilini itmamə yetirəm.* M.F.Axundzadə. *Qazının qısıla-qısıla gəlməyinə ağa artıq etina etməyib, bir az da irəli gəlməyə aman verir və sonra dönüb bir təpik vurur.* Çəmənzəminli.

3. Rəhm, mərhəmət. *Düşmənə aman yoxdur. – Ovçuda aman olur; Əlində kaman olur; Oxlama, yar, könlümü; Ox dəysə, yaman olur.* (Bayatı). ☐ **Aman vermək** – rəhm etmək, mərhəmət etmək, əfv etmək, bağışlamaq. *Get, düşmənə aman vermə davada; Batır suda, vur quruda, havada!* S.Vurğun.

4. İmdad, yardım, kömək, nicat, mərhəmət diləyi. *Aman istəmək. – Amana gələnin boynunu qılınc kəsməz.* (Ata. sözü). *Yandı bağrım, döndü qana; Bir namə yaz Divarqana; Daha səndən aman olmaz.* Aşıq Abbas.

5. Taqət, qüvvət, güc. *Dad edib suzəni çəkdim əlindən; Qoymadı canımda aman ayrılıq.* (Qoşma). ☐ **Amanı kəsilmək (qırılmaq)** – üzülmək, əldən düşmək, yorulmaq, taqətdən düşmək. **Amanını kəsmək** – yormaq, üzmək, əldən salmaq, taqətdən salmaq. *Soyuq əsgərin amanını kəsdi.*

6. *nida*. Can ağrısı, həyəcan, fəryad, iztirab, qorxu və s. hissləri ifadə edir. *Aman, başım ağrıyır. Aman, sancıdan öldüm! Aman, qıçım sındı! – Gözlə zülfün bad vurar; Bad əlindən dad vurar; Dərddən aman deyənin; Boynunu cəllad vurar.* (Bayatı). *Ay sevdiyim, səndən qeyri kimim var; Gəl üstümə, aman, öldüm, dad, öldüm!* M.V.Vidadi. *Nələr gördün, aman, Vaqif! Nə qansızmış zaman, Vaqif!* S.Vurğun. // Heyrət, təəccüb bildirir. *Aman, bu sənsən! Aman, bu nədir?*

7. *nida*. Rica, xahiş, yalvarış bildirir (bəzən "amandı", "amandır" şəklində işlənir). *Gecə-gündüz fikrim-zikrim, əzbərim; Üzüldü taqətim, aman, bəri bax!* M.P.Vaqif. *Ey yığılan canlar, siz olun tanrı; Amandı, qoymayın yar oyanmasın.* Q.Zakir. *Məni yandırma, amandır; Ürəyim dopdolu qandır.* M.Ə.Sabir. // Yenə həmin mənada bəzən "günüdür" sözü ilə bərabər işlənir. *Aman günüdür, onu tək qoyma. Aman günüdür, tək getmə. Aman günüdür, özünü gözlə.*

8. *nida*. Narazılıq, şikayət, nifrət bildirir (çox vaxt "əlindən" sözü ilə birlikdə). *Aman yaman yoldaş əlindən! – Vaqif deyir: sənin əlindən aman; Mən biçarə nə havalı sevmişəm.* M.P.Vaqif.

◊ **Aman evi** – daldalanacaq yer, pənah gətiriləcək yer. (Qarabağ xanı Pənah xan bu fikirdə oldu ki), .. *möhkəm bir bina və qala tikilsin. Bir hadisə üz verdiyi zaman ora məskən; tənglik və bolluq vaxtında isə aman evi olsun.* A.Bakıxanov. **And-aman eləmək** – b a x **and-aman.**

**AMANABƏND** b a x **amanatabənd.**

**AMANATABƏND** *zərf* 1. Bir şeyi etməyə hazır, bəhanə gözləyən, bir himə bənd, işarəyə bənd.

2. Sınıq-salxaq, davamsız; uçulmaq, dağılmaq, yıxılmaq üzrə olan.

**AMANI** b a x **amanatabənd.**

**AMANSIZ** *sif.* Rəhmsiz, mərhəmətsiz, rəhm bilməyən, mərhəmət bilməyən; barışmaz. *Amansız zərbə. Amansız ölüm. Düşmənlərə qarşı amansız* (z.) *olmalı!* – [Səriyyə] *mübarizə etmək, amansız taleyi ilə üz-üzə durmaq iqtidarında deyildi.* M.İbrahimov. *Buradakı mülayim təbiətli sadə insanların qəlbi bu gün amansız bir kinlə döyünür.* M.Hüseyn. [Şairin] *qəlbində nə isə böyük, amansız və gözəl bir qüvvə baş qaldırdı.* Ə.Məmmədxanlı.

**AMANSIZCA(SINA)** *zərf* Amansız bir surətdə, rəhm etmədən, yazığı gəlmədən; çox sərt bir surətdə. *Amansızcasına mübarizə etmək. Üsyançılara amansızcasına divan tutuldu. Amansızcasına cəza vermək.*

**AMANSIZLIQ** *is.* Rəhmsizlik, mərhəmətsizlik; barışmazlıq, sərtlik; şiddət. *Mübarizənin amansızlığı. – Bütün bunlar, elə bil, düşmənlərin amansızlığını, inad və qətiyyətini daha da artırmışdı.* Ə.Əbülhəsən.

**AMAN-ZAMAN** *sif. dan.* Tək, var-yox, yalnız, vahid. *Aman-zaman bir oğlu var.*

**AMAZONLAR** *cəm* [*yun. xüs. is.*-dən] *mif.* Qədim yunan əsatirində: Qara dəniz sahillərində yaşamış və qonşu ölkələrə basqınlar etmiş cəngavər qadınlar. *Qafqaz amazonları barədə əfsanələr məlumdur.*

**AMBIL** *is. məh.* Xışa qoşulmuş öküzlərin birinci cütü. *Qulaməli kəlləri hayqırıb .. ambıl kəlinin yanı ilə addımladı.* S.Rəhimov.

**AMBIR** *is. xüs.* Dəmirçilərin, nalbəndlərin işlətdiyi iri kəlbətin.

**AMBIRAĞIZ** *is. xüs.* Məftil kəsmək üçün kiçik kəlbətin.

**AMBÍSİYA** *is.* [*fr.*] Lovğalıq, təkəbbür, təşəxxüs, iddia etmə.

**AMBULATÓRİYA** *is.* [*lat.*] *tib.* Xəstəxanadan kənar müalicə müəssisəsi. *Ambulatoriya binası. Ambulatoriya müalicəsi.*

**AMERİKALI**, **AMERİKAN** *is.* Amerika Birləşmiş Ştatlarının əhalisinə mənsub olan şəxs. *Drayzer sadə amerikalıların faciəli taleyini təsvir edirdi.*

**AMERİKANÍZM** [*xüs. is.*-dən] 1. Amerika millətçiliyi.

2. Amerika Birləşmiş Ştatlarında ingilis dili xüsusiyyəti.

**AMFÍBİYA** [*yun.*] 1. *zool.* Həm quruda, həm də suda yaşayan heyvan.

2. *bot.* Həm quruda, həm də suda bitən bitki.

3. Həm suda, həm də quruda enib qalxa bilən təyyarə, həmçinin suda və quruda hərəkət edən avtomobil, tank.

**AMFİTEÁTR** [*yun.*] 1. Qədim yunanlarda və romalılarda: ətrafında tamaşaçılar üçün yarımdairə şəklində pillə-pillə yüksələn yerlər olan tikili, tamaşagah. Amfiteatrın ortasında arena var idi.

2. Müasir teatrlarda: parterlərin dalında və ya lojaların üstündə pillə-pillə yüksələn yarımdairə şəklində yerlər. // Amfiteatr kimi getdikcə yuxarı qalxan şey haqqında. *Amfiteatr şəklində dənizdən təpələrə doğru yüksələn şəhər milyon işıqları ilə parlayırdı.* Ə.Sadıq.

**ÁMFORA** *is.* [*lat.*] Yağ və şərab saxlamaq üçün iki şaquli qulplu yumurta formalı qab. *Amfora çox vaxt rəsmlərlə bəzədilirdi.*

**AMİL¹** *is.* [*ər.*] Bir prosesin, hadisənin hərəkətverici qüvvəsi, səbəbi. *Hava, torpaq və su kimi təbii amillər insanın həyatında olduqca böyük rol oynayır.* // Səbəb, vasitə. *Qorxunun çoxluğu ehtiyatlı olmaq fikrini doğuran birinci amildir.* M.S.Ordubadi. *Polifonik metod musiqi əsərlərində canlı, parlaq obrazların yaradılması üçün çox qüdrətli bir amildir.* Ə.Bədəlbəyli.

**AMİL²** *is.* [*ər.*] *köhn.* Tacir müvəkkili, ticarət agenti. *İstanbulda, Bakıda, Tiflisdə, Batumda onun* [Hacı Kamyabın] *amilləri var idi.* Ə.Haqverdiyev. *Amillərə tüccardən artıq əsərin var; Fəthin, zəfərin var.* M.Ə.Sabir.

**AMİLLİK** *is. köhn.* Amil vəzifəsi və işi (b a x **amil²**). [Oğlu atasına:] *Rəhman tacir, neçə vaxtdır, mənim dalımca gəzir, məni özünə amilliyə çağırır..* Ə.Haqverdiyev.

**AMİN** [*ər.* əsli *qədim yəh.*] *din.* Qəbul olsun, arzun yerinə yetsin, olsun (adətən dua və sənaların axırında söylənir). *Əziziyəm, bir amin; Bir dua de, bir amin; Bu gündən məhəbbətim; Artıb sənə birə min.* (Bayatı). *Camaat da qazıya baxıb səsləndi: – Amin!* C.Məmmədquluzadə. ☐ **Amin deyən** *məc.* – öz fikri olmayıb, başqasının dediyini təkrar edən, bəli-bəli deyən, başqasının sözü ilə durub-oturan adam. **Amin demək** *məc.* – öz fikri olmayıb, başqasının dediyini təkrar etmək, "bəli-bəli" demək.

**AMİNXAN** [*ər.* amin və *fars.* xan] *din.* Amin deyən, amin oxuyan.

**AMİR** *is.* [*ər.*] Buyuran, əmr edən, hökm edən; başçı, böyük. *Millətə çatdıqca qəm, əyyaş idik; Hakimə yar, amirə qardaş idik.* M.Ə.Sabir. *Yavər mətbəxdə xörək hazırlayır Şəhla xanım bir amir kimi ona göstəriş verirdi.* S.Rəhimov.

**AMİRANƏ** *zərf* və *sif.* [*ər.* amir və *fars.* ...anə] Əmr edərcəsinə, hökm edərcəsinə. *Mən istərəm çıxarmağa könlümdən eşqini; Qılmaq itaət əmrimə, pək amiranədir.* M.Hadi. *Fəhlələr uşağın bu amiranə sözündən gülümsəyərək, bir-birinin üzünə baxdı(lar).* A.Şaiq. *Bəy ona amiranə ifadə ilə tapşırdı: – Yoldaşlar məclisi sənə həvalə edirlər.* Mir Cəlal.

**AMİRLİK** "Amir"dən *mücər.* ..*Mənim bir Şərq kişisi amirliyi ilə dediyim sözlər onu* [qızı] *təəccübləndirməyə bilməzdi.* M.S.Ordubadi.

**AMMA** *bağl.* 1. Cümlələri, habelə cümlə üzvlərini (əsasən həmcins üzvləri) birləşdirərək qarşılıq bildirir. ..*Amma şirin dilli, açıq qabaqlı; Könül aşinası, hayıf ki, yoxdur.* M.P.Vaqif. *Sən bir gözəlcə qönçəsən, amma yabanısan.* A.Səhhət. [Ramazan:] *Doğrudur, çox qocalmışam, amma cavanlardan geri qalmıram.* M.Hüseyn.

2. *Nida mənasında.* Təəccüb, mübaliğə, istehza, kinayə bildirir. *Amma nə oxudu! Amma nə dedin! – Moldayı, gördün nə iqdam etdi? Amma millət a! Az zamanda nə sərəncam etdi! Amma millət a!* M.Ə.Sabir.

**AMMİÁK** [*yun.*] *kim.* Azot ilə hidrogen birləşməsindən əmələ gələn kəskin qoxulu rəngsiz qaz. – *Mədən gübrələri ammiak şorasından ibarətdir.*

**AMMÓNİUM** [*yun.*] *kim.* Bir çox duzların tərkibində olan, sərbəst halda tapılmayan, tərkibi azot və hidrogendən ibarət olan atomlar qrupu (texnika və kənd təsərrüfatında işlədilir). *Ammonium duzları.*

**AMNÍSTİYA** [*yun.*] Ali dövlət orqanının qərarı ilə məhkəmə tərəfindən iş kəsilmiş şəxslərin cəzasının yüngülləşdirilməsi, yaxud onların cəzadan tamamilə azad edilməsi. // Ali dövlət orqanlarının bu xüsusda verdiyi fərman. *Amnistiya haqqında aktın şərtləri.*

**AMÓRF** *sif.* [*yun.*] Formasız, şəkilsiz. *Təbiətdə amorf maddələr kristallara nisbətən azdır.* ☐ **Amorf dillər** *dilç.* – sözlərin formal (şəkli) əlamətləri (məs.: sonluqları) olmayan və buna görə də müxtəlif qrammatik əlaqələri (hal, say, şəxs, zaman və s. münasibətləri) köməkçi sözlərlə, cümlədə sözlərin sırası ilə ifadə olunan dillər (məs.: Çin dili). *"Xalis" amorf dillər yoxdur.*

**AMORTİZÁSİYA** [*lat.*] 1. *iqt.* Avadanlığın işlənməsi nəticəsində dəyərinin getdikcə azalması.

2. *tex.* Xüsusi mexanizmlərin köməyi ilə avtomobil, təyyarə və s.-də zərbə və təkan təsirinin azaldılması.

**AMORTİZÁTOR** [*fr.*] Avtomobil, təyyarə və s. maşın və cihazlarda zərbənin təsirini azaldan mexanizm. *Yaylı amortizator.*

**AMPÉR** [*xüs. is.*-dən] *fiz.* Elektrik cərəyanı gücünün ölçü vahidi. *Mütləq amper.*

**AMPERMÉTR** [*xüs. is.* amper və *yun.* metr] *fiz.* Elektrik cərəyanı şiddətini ölçmək üçün cihaz. *Ampermetrin daxili müqaviməti.*

**AMPÍR** [*fr.*] *sənət.* I Napoleonun imperatorluğu dövründə Fransada meydana gəlmiş bədii üslub (əsasən memarlıqda və tətbiqi incəsənətdə). *Klassisizm zəminində yaranmış ampir üslubu.*

**AMPLİTÚDA** [*lat.*] *fiz.* 1. Rəqs edən cismin tarazlıq vəziyyətindən uzaqlaşdığı nöqtələr arasındakı məsafə. *Rəqs amplitudası.*

2. Barometrdə və ya termometrdə yüksəkliklər fərqi.

**ÁMPLUA** [*fr.*] 1. Aktyorun xüsusiyyətinə görə ifa etdiyi müəyyən rollar dairəsi. *Sənətdə Ərəblinskinin ampluası möhtəşəm qəhrəmanlar rolu idi.* S.M.Qənizadə. [Ruhulla] *ancaq Ərəblinski ilə tanış olandan sonra öz ampluasını tapa bildi.* S.Rəhman.

2. Ümumiyyətlə rol. *Aktyorun dar amplua çərçivəsi.*

**ÁMPUL** *is.* [*lat.*] *tib.* İçində dərman maddələri saxlamaq üçün hər tərəfi qapalı şüşə borucuq.

**AMYÖB** [*yun.*] *zool.* Təkhüceyrəlilərə mənsub olub, şirin suda yaşayan və daimi forması olmayan mikroskopik (adi gözlə görünməyən) ibtidai heyvan. *İbtidai hey-*

*vanlar: infuzorlar, amyöblər və s. ən sadə quruluşa malik heyvanlardır.* M.Axundov.

**AN** *is.* [*ər.*] Ən cüzi bir zaman, ləhzə, dəm, bir gözqırpımlıq müddət. □ **Bir an** – bir saniyə, bir dəqiqə. *Bir an onu gözündən qoymadı. – Bir an səni görməyəndə, yarım; Əfğanı yetirrəm asimanə.* Heyran xanım. *Gözünü uşaqdan, anadan bir an; Ayıra bilmirdi Növrəstə qarı.* R.Rza. [Kamil və Murtuzov] *bir an bərabər ixtiyara malik adamlar kimi çiyin-çiyinə dayanıb gülüşdülər..* S.Rəhimov. **Bir anda, bir an içində** – dərhal, o saat, göz yumub açınca. *Bu xəbər bir anda ağalıq xidmətlərinə yayıldı.* S.S.Axundov. *Kəklik onun* [qardaşının] *əlindən ox kimi çıxdı və bir anda ormanın yarpaqları arasında qeyb oldu.* A.Şaiq. *Buğa bir anda hərlənib ona* [Buğaca] *sarı cumdu.* M.Rzaquluzadə. **Bir anlıq, bir anlığa** – çox az bir zaman üçün, bir ləhzə, bir göz açıb yumunca. *Adamlar bir anlığa təəccüblə bu qəribə səsə tərəf dönərək, yenə öz işlərinə .. başladılar.* M.İbrahimov. *Sonra açır qapını, budur iclas salonu; Xatirələr bir anlıq alıb aparır onu.* R.Rza. *Durdu bir anlığa o birdən-birə; Düşdü qar üstünə, yıxıldı yerə.* M.Rahim. // Ümumiyyətlə, vaxt. *Onun* [vətənin] *üzərində həyatımın qüssə və kədəri bilmədiyim anları keçmişdir*. M.S.Ordubadi. *Evlərindən ayrıldıqları andan onları* [Səriyyəgili] *dözülməz iztirablarla dolu bir həyat qucağına aldı.* M.İbrahimov. [Mehrəli bəy:] *Xeyr, mən bu ana kimi şərəflə yaşamışam.* S.S.Axundov. **Bu an, bu anda** – bu zaman. *Bu anda qoca usta başını dik qaldırıb, dəmir qüllənin zirvəsində durmuş fəhləni səslədi.* M.Hüseyn. [Əziz] *bu an bütün fikrini artezian quyusuna, onun suyuna cəlb etmişdi.* Ə.Vəliyev. *Elə bu anda onun* [şairin] *pəncərəsində nə isə bir şölə titrədi və söndü.* Ə.Məmmədxanlı. **Hər an, hər anda** – hər zaman, həmişə, daim. *Sabir, ey aləmi-xəlqə tərcüman; Ey hər anda kasə-kasə zəhr udan!* A.Səhhət. *Dünyanın dərdini, qəmini hər an; Mənə bir baxışla unutdurursan.* S.Vurğun.

**ANA** *is.* 1. Övladı olan qadın. *Ana məhəbbəti. Mehriban ana. Bütün qədim şairlər analarının südü ilə yoğrulmuş dildə yazırdılar. – Anasına bax, qızını al.* (Məsəl). [Zeynəb:] *Eh, Dilrüba, sən özün də ana olacaqsan.* M.S.Ordubadi. *Gəlinin sözləri anasını da kövrəltdi.* Çəmənzəminli. *Dörd ay vardı, ananın gözləri yol çəkirdi*. S.Rüstəm. // Məc. mənada. *Zaman bizə bir anadır; Biz zamanın övladıyıq!* S.Vurğun.

2. Öz balalarına nisbətən heyvan, balası olan heyvan. *Quzular analarını əmirlər. Pişiyin balası lap anasına oxşayır.*

3. Yaşlı qadına hörmətlə müraciət. *Ana, bir az su verin.*

4. *məc.* Bir şeyin əsas qismi, mərkəzi, kökü mənasında. *Ana çay. Ana zoğ. Ana dili. – Bütün ana və qol arxlar təmizlənib qaydaya salınmışdır.* // *məc.* Bəsləyici, qidalandırıcı, tərbiyələndirici. *Hündür dağlar sizin ilə öyünür; Anasınız çay, bulağa, buludlar.* H.K.Sanılı.

5. *məc.* Müxtəlif oyunlarda başçı. *Uşaqlardan bir nəfər nüfuzlusu "ana"* (*oyun başçısı*) *olardı.* H.Sarabski.

◊ **Ana bətni** – ana qarnı, uşaqlıq. *Bəlkə də onların* [Bab və Bəhanın] *ana bətnindən alim doğulduğuna inananlar tapılırdı.* M.S.Ordubadi. **Ana Vətən, ana torpaq, ana yurd** *tənt.* – Vətən. *Onun sadə həyatını mən bilirəm; Bilir bizim ana torpaq, ana vətən.* S.Vurğun. *Mən deyirdim ki, bir gün varıb ana yurduna; Öpərsiniz anamın toz basan məzarını...* A.İldırım. **Ana dili** – bir adamın doğma dili, körpəlikdən öz ata-anasından öyrəndiyi dil. *..Ərəb və fars kəlmə və ibarələrinin şövq və həvəsində olub, ehtiyac olmadığı halda onları ana dilinə qatıb qarışdırmaq, bizim əqidəmizcə, böyük səhvdir.* F.Köçərli. *Füzuli bayraq etdi doğma ana dilini; O bu dildə ilk dəfə "Leyli-Məcnun" yaratdı.* B.Vahabzadə. **Ana xətti** – əsas, mühüm cəhət. *Lakin özlüyündə müstəqil olan bütün bu musiqi parçaları arasında müəyyən bir rabitənin varlığı və bununla da bütün nömrələrin bir ana xəttinə əsaslanması lazımdır.* Ə.Bədəlbəyli. **Ana südü kimi** *məc.* – halal, qanuni. [Həsən:] *Ay mirzə, Allahı sevərsən, kasıb adamam, mənim evimi yıxma, yediyin nahar da ana südü kimi halalın olsun.* Ə.Haqverdiyev. **Ana uşağı** *məc.* – utancaq, dilsiz-ağızsız,

fağır. *Dördillik məktəb həyatında özünü ana uşağı kimi aparan Səlim birdən-birə dəyişdi.* M.Hüseyn. **Anadan olmaq** – doğulmaq. *Nurəddin .. anadan olandan öz şəhərlərindən başqa bir yer görməmişdi.* S.S.Axundov. **Anan ölsün!** – təəssüf, kədər bildirir. [Əhməd:] *..Dərdlər dərmanı tapılmaz məgərinki bu kitabların içində... Anan ölsün kitab yazan!..* N.Vəzirov. **Anası mələr qalmaq** – ölmək. **Anası ölmüş (ölsün) –** 1) yazıq, fağır, biçarə, bədbəxt (təəssüf bildirir). [Məsmə:] *Təzəlikdə heç xəbər-ətər yoxdur. Anası ölmüş* [Bəndalı] *düşdü qürbətə, yaman düşdü.* Mir Cəlal. *Səlbi təzədən dilləndi: – Anası ölmüşü harada qoyub gəldin?* Ə.Vəliyev; 2) qoçaq, zirək (tərif yerində işlənir). **Anasını ağlar (mələr) qoymaq** – divan tutmaq, öldürmək, bədbəxt etmək, müsibətə uğratmaq. [Rəşid:] *..Yadında saxla, mənim tikəmə əl uzadanın anasını ağlar qoyaram.* İ.Şıxlı. **Anasını ağlatmaq** – zülm etmək, divan tutmaq, bərk cəzalandırmaq, öldürmək. [İsmayıl bəy:] *Sən məni şahid yaz, mən onun* [Camal bəyin] *anasını ağladım.* N.Vəzirov. *Güldü, sinəsini dağladıb haqqın; Güldü, anasını ağladıb haqqın.* B.Vahabzadə. **Anası vayına oturmaq** – ölmək. **Uşaqların anası** *dan.* – evfemistik yol ilə ərin öz arvadının adını çəkməmək üçün işlətdiyi ifadə. [Kərəməli:] *Eşitməyibsənmi ilan vuran yatar, ac yatmaz. Səndən də üzüm qara, uşaqların anası da yorğana bürünüb hıçqırırdı.* İ.Şıxlı.

**ANA-BACI** *is. dan.* Ana və bacı kimi olanlar, bir-birinə çox yaxın olanlar; yaxın dostlar, rəfiqələr.

**ANA-BALA** *is.* Ana ilə oğlu və ya qızı. *Səməd getdi. Ana-bala baş-başa verib ağlaşdılar.* B.Talıblı. *Taxt üstündə ana-bala oturublar yanaşı.* Ə.Cəmil. // Heyvanlar haqqında. *Qoyunlar sağılıb qurtardıqdan sonra ağılın ağzını açarkən ana-bala mələşə-mələşə qaçaraq bir-birinə qarışırdı.* A.Şaiq.

◊ **Ana-bala eləmək** – lazım olmadığı halda eyni şeydən bir neçə dənə almaq. **Ana-bala kimi** – çox mehriban, məhəbbətli. **Ana-bala olmaq** – ana ilə bala kimi mehriban olmaq, məhəbbətli olmaq.

**ANAC** *sif.* 1. Dəfələrlə bala doğub, yaxud bala yetişdirib qartlaşmış (heyvan haqqında). // İri, yekə, güclü, qüvvətli (heyvan haqqında). *Anac qurbağa. Anac toyuq. – Amma kənddən çıxıb bostanlar arasındakı cığıra təzəcə ayaq basmışdıq ki, anac bir dovşanın ombasını yuxarı ata-ata qabağımıza düşüb qaçdığını görmüşdük.* Ə.Məmmədxanlı.

2. *məc. dan.* Bir işdə qocalıb təcrübə qazanmış.

**ANACAN** *is.* Anaya nəvazişlə müraciət. [Rəsul:] *Anacan, dayanmağa halım yoxdur, gərək mən gedəm.* "Aşıq Qərib".

**ANACIQ**, **ANACIĞAZ** "Ana"dan *oxş.*

**ANACLANMAQ** *f. dan.* Böyümək, yekələşmək. // Qocalıb təcrübəliləşmək, ustalaşmaq.

**ANACLIQ** *is.* 1. Dəfələrlə bala doğub yetişdirmiş və qartlaşmış heyvanın halı.

2. İrilik, yekəlik.

**ANA(DAN)BİR** *sif.* Bir anadan olan, bir anadan doğulan.

**ANADANDOĞMA** b a x **anadangəlmə.**

**ANADANGƏLMƏ** *sif.* 1. Lap doğulandan xas olan; xilqətində, yaradılışında olan; fitri. *Anadangəlmə nöqsan. Anadangəlmə pəltək. Anadangəlmə lal.* – [Mürşüd:] *Adamda gərək qanacaq anadangəlmə olsun.* S.Rəhman. [Əzizin] *..anadangəlmə sağ ayağı sol ayağından azacıq gödək idi.* İ.Məlikzadə.

2. *məc. dan.* Tamamilə lüt, çılpaq. ☐ **Anadangəlmə olmaq** – lüt olmaq.

**ANÁFORA** *is.* [*yun.*] Misraların əvvəlində eyni səsin və ya eyni sözün təkrarı.

**ANAXRONÍZM** [*yun.*] Bədii əsərdə keçmişin təsvirində xronoloji dəqiqliyin bilmədən, yaxud bilərəkdən pozularaq başqa dövrün hadisə əlamətlərinin əsərə gətirilməsi. *Orta əsrlər, İntibah dövrü və klassisizm incəsənəti və ədəbiyyatı üçün anaxronizm səciyyəvi haldır.*

**ANAXTAR** *is. məh.* Açar; sandıq açarı.

**ANAKONDA** *is.* [*isp.*] Yatağanlar fəsiləsindən ən böyük ilan. *Anakondanın rəngi zeytunu-bozdur.*

**ANALGÍN** *is.* [*yun.*] *əcz.* Ağrıkəsici, qızdırmasalan və iltihaba qarşı dərman preparatı. *Analginin ən yüksək dozası.*

**ANALI** *sif.* Anası olan. *Analı uşaq. Analı quzu. – Analı quzu, xınalı quzu.* (Məsəl). *Analı evlərdə cənnət yaranar; Anasız evlərdə həsrət yaranar.* Şəhriyar.

**ANALI-ATALI** *sif.* Anası və atası olan. *Analı-atalı* (z.) *böyüsün.*

**ANALI-BALALI** *zərf* Ana ilə bala bir yerdə, hamısı bir yerdə, bərabər. *Analı-balalı bütün qoyunları siyahıya almaq.*

**ANALIQ** *is.* 1. Ananın öz uşaqları ilə olan əlaqə və münasibəti, ana vəzifəsi. *Analıq hissi. Analıq borcu. Analıq etmək. Analıq insan sevincinin tükənməz mənbəyidir. – Cəmalə indi bilirdi ki, onun elmi işləri ilə yanaşı, bir analıq vəzifəsi də vardır.* S.Rəhimov. *Ceyran Səltənətin uşağına, analığına, sadəliyinə gülürdü.* Mir Cəlal.

2. Ögey ana, ana vəzifəsini görən qadın. [Sara:] *Hərçənd biz bir günah iş görmürük, amma hər halda Gülnisə mənim analığımdır.* C.Cabbarlı.

3. *sif.* Anaya məxsus, anaya aid olan. *Analıq hüququ.*

**ANALİTÍK** *sif.* Analizə aid olan, analizə xas olan; analiz tətbiq edən. *Analitik təhlil mərkəzi. Analitik üsul.* ☐ **Analitik dillər** *dilç.* – cümlələrdə sözlər arasındakı əlaqə sözlərin özlərinin formaları ilə deyil, köməkçi sözlər, sözlərin sıralanması və s. vasitəsi ilə ifadə olunan dillər (ingilis, roman dillərində və bəzi başqa dillərdə olduğu kimi). **Analitik həndəsə** *riyaz.* – həndəsənin həndəsi xətləri, səthlərin və cisimlərin xassələrini cəbr və təhlil üsulu ilə öyrənən bəhsi.

**ANÁLİZ** [*yun.*] Tədqiq olunan şeyin hansı tərkib hissələrindən ibarət olduğunu, yaxud onun tərkibinə nə miqdarda bu və ya digər maddənin daxil olduğunu müəyyən etmək üçün tətbiq edilən əməliyyat; təhlil. *Analiz və sintez. Kimyəvi analiz. Mədə şirəsi analizi. – Qəbuldan sonra Firuzə kabineti intizama salırdı və laboratoriyada qan analizi üzərində çalışırdı.* C.Cabbarlı.

**ANALÓGİYA** [*yun.*] 1. Hadisələr, məfhumlar, şeylər arasında oxşarlıq, bənzərlik, uyğunluq.

2. Məntiqdə: iki əşya və ya hadisənin hər hansı cəhətdən bir-birinə bənzərliyinə əsaslanaraq, onların digər cəhətlərdən də bir-birlərinə bənzəmələri haqqında nəticə çıxarmaqdan ibarət mühakimə üsulu. *Analogiya məfhumunu elmə Aristotel daxil etmişdir.*

**ANANÁS** [*isp.*] Asiya, Afrika və Avropanın isti yerlərində yetişən iri, uzunsov, sərtqabıqlı, ətirli, şirəli meyvə verən ağac. *Əsil ananasın yarpaqlarından iplik alınır.* // Bu ağacın, iri yumurta şəklində olan ətirli, şirəli meyvəsi.

**ANARXÍST** Anarxizm tərəfdarı.

**ANÁRXİYA** [*yun.*] Hərc-mərclik, hökumətsizlik, başlı-başınalıq, qarışıqlıq, pozğunluq.

**ANARXÍZM** [*yun.*] 1. Hər cür dövlət hakimiyyətini və siyasi mübarizəni inkar edən və proletariatın inqilabi hakimiyyəti əleyhinə çıxan xırda burjua ictimai-siyasi cərəyanı. *Anarxizmin əsas ideyası.*

2. *məc.* Hərc-mərclik, qarışıqlıq, başlı-başınalıq.

**ANÁRXO-SİNDİKALÍST** Anarxo-sindikalizm tərəfdarı.

**ANÁRXO-SİNDİKALÍZM** Beynəlxalq həmkarlar ittifaqı hərəkatında ideoloji və siyasi cəhətdən anarxizm təsiri altında olan cərəyan. *Anarxo-sindikalizmin mövqeləri zəiflədi.*

**ANASIZ** *sif.* və *is.* Anası olmayan, ana tərəfdən yetim. *Anasızın gördüyü iş danlaqsız bitməz.* (Ata. sözü). [Fərhad:] *Deyirlər ki, atasız adam yetim olmaz, anasız yetim olar.* Ə.Haqverdiyev.

**ANASIZLIQ** *is.* Anasız adamın halı.

**ANAŞA** *is. dan.* Xaşxaşdan hasil olan çox zəhərli narkotik maddə.

**ANAŞAÇƏKƏN** bax **anaşaçı** 1-ci mənada.

**ANAŞAÇI** *is. dan.* 1. Anaşa çəkən adam.

2. Anaşa hazırlayan və ya satan adam.

**ANÁTOM** *is.* [*yun.*] Anatomiya mütəxəssisi, anatomiya ilə məşğul olan alim.

**ANATOMİK** *sif.* Anatomiyaya aid olan. *Anatomik atlas. Bədənin anatomik quruluşu.*

**ANATÓMİYA** *is.* [*yun.*] Canlı orqanizmin forma və quruluşundan bəhs edən elm. *İnsan anatomiyası. Bitki anatomiyası. Anatomiya terminləri lüğəti.*

**ANAYOLU** *is. etnoqr.* Köhnə məişətdə: ərə gedən qızın ər evindən anasına gətirdiyi hədiyyə, sovqat.

**ANBAAN** *zərf* Getdikcə, tədriclə; dəqiqəbədəqiqə, arası kəsilmədən, fasiləsiz. *Xəstənin qızdırması anbaan artır. – Boy artdıqca anbaan, divarlar qarış-qarış; Palçıqdan ətir qalxdı, a dostlar, gülab kimi.* S.Rüstəm.

**ANBAR** *is.* Taxıl, ərzaq, mal və s. saxlanmaq üçün xüsusi bina, tikili. *Taxıl anbarı. Ərzaq anbarı.* □ **Anbara vurmaq** – 1) saxlamaq üçün anbara yığmaq; 2) *məc.* sonradan baha qiymətə satmaq üçün yığıb saxlamaq. **Bir anbar** – anbar dolusu, çoxlu. [Molla:] *Görmürsən, bir anbar pul gətirmişəm.* "M.N.lətif.".

**ANBARÇI** *is.* 1. Anbara baxan və ya anbarda işləyən adam; anbardar.

2. *köhn.* Keçmişdə anbarda külli miqdarda mal saxlayan iri tacir.

**ANBARÇILIQ** *is.* Anbarçı vəzifəsi, işi.

**ANBARDAR** b a x **anbarçı.** *Nə hesabdar yazır, nə anbardar buraxır, nə də fəhlə taya yaxın gəlirdi.* Mir Cəlal.

**ANBARDARLIQ** b a x **anbarçılıq.**

**ANBARGÜVƏSİ** *is. zool.* Taxıla düşən güvə, taxılbiti.

**ANBARLAMAQ** *f. dan.* Anbara yığmaq, anbara vurmaq, anbara yığıb saxlamaq.

**ANCAQ** 1. *bağl.* Lakin, amma. *Ancaq mən sevgilərin bu qədər aldadıcı .. olduğunu bilmirdim.* M.S.Ordubadi. [Müdir:] *Ancaq eşitdiyimə görə, sizin yoldaşınız Cəmili çox incidir.* Mir Cəlal.

2. *Zərf mənasında.* Çətinliklə, zorla, gücbəla ilə. *Tamaşanın üçüncü pərdəsinə ancaq çata bildim. Bu işi axşama ancaq qurtarmaq olar. Bu yerə ancaq beş adam yerləşə bilər. O, axırıncı sözü ancaq söyləyə bildi. – Görünüşündən* [Almurada] *50 yaş ancaq vermək olardı.* İ.Əfəndiyev.

3. Ədat kimi işlənir – məhz, sırf, yalnız, tək. *Biz buraya ancaq iş üçün gəlmişik. Buna ancaq təəccüb etmək olar. Ancaq nağılla tərbiyə olunmuş beyin hər cür yeniliyə ürəkdən qol aça bilər. – Evin dolanacağı ancaq Cavadın qələminə bağlı idi.* Ə.Haqverdiyev. [Şair:] *Bunlar ancaq tərbiyə və istedadın nəticəsində incəsənətin bu qədər ali dərəcəsinə çıxa bilmişlər.* M.S.Ordubadi.

**ancaq-ancaq** *zərf* Azacıq, güclə, çətinliklə. *Tozun və küləyin təsirindən fənərlərdə yanan lampaların işığı bulud dalğasında ulduz kimi ancaq-ancaq görünür*(*dü*). S.M.Qənizadə.

**AND** *is.* Bir şey haqqında verilən təntənəli vəd, söz. // Sədaqətə riayət etmək haqqında rəsmi və təntənəli vəd. *Əsgəri and. – Andına inanıram, xoruzun da quyruğu görünür.* (Ata. sözü). *Bu and ilə xəbər verir bizə cəbhədən; Bizim zəfər toplarının o qadir səsi.* S.Vurğun. □ **And içdirmək** – and içməyə, söz verməyə məcbur etmək. **And içmək** – 1) müqəddəs, yaxud böyük və əziz sayılan bir şəxsin və ya şeyin adını çəkməklə öz sözünə, vədinə, yaxud öhdəsinə aldığı vəzifəni layiqincə yerinə yetirəcəyinə inandırmaq. *Mənim and içdiyim o məhəbbətin; Ruhunda müqəddəs bir pəri yaşar.* S.Vurğun. *Musa dayının nə üçün and içmədiyi* [Firidunun] *fikrində anlaşılmaz bir sirr olub qalmışdı.* M.İbrahimov; 2) söz vermək. *Camaatın vəziyyəti elə idi ki, guya hamı əlini bir işə vurmayacağına and içmişdi.* Ə.Vəliyev. **And vermək** – müqəddəs, yaxud əziz sayılan bir şəxsin, ya şeyin adını çəkməklə xahiş etmək, yalvarmaq. *And verib soruşdum bir-bir dedilər; Fəqir, səni şeyda qılan gəlməmiş.* Q.Zakir. *Əzizim binə gəlsin; Köç gəlsin, binə gəlsin; Sevdim tərsa qızını; And verin dinə gəlsin.* (Bayatı). **Andı(nı) pozmaq** – verdiyi vədə yalançı çıxmaq, andı yerinə yetirməmək. **Andından dönmək** – b a x **andı(nı) pozmaq**. *Qardaşım! Dönmərəm öz andımdan!* S.Rüstəm.

**AND-AMAN: and-aman eləmək** – bir şeyi inkar və ya təsdiq etmək üçün and içmək, dəlillər və sübutlar gətirib inandırmağa çalışmaq. *Bir dəfə* [Miraxur] *arvadını öldürmək istəmiş, arvad and-aman eləyib, onu şübhədən daşındırmışdı.* Çəmənzəminli.

**ANDÇI** *is. köhn.* Keçmişdə məhkəmədə və s.-də başqasının yerinə and içən inanılmış və nüfuzlu adam.

**ANDDAŞ** *is.* Müəyyən əhd, şərt üçün andlaşıb bir-birinə təntənəli vəd verən adamların hər biri.

**ANDIR** *is. dan.* Əsil mənası "sahibsiz, yiyəsiz mal, ölən bir şəxsin qohumlarına irs qoyub getdiyi mal, şey" olub indi, adətən, canlı dildə söyüş, qarğış yerində (bəzən "andıra qalmış" şəklində işlənir) işlənir. *Andıra qalmış nə yaman səslənir; Söz deməyə vermir aman, səslənir.* M.Ə.Sabir. *Vaqif heyifsilənərək: – Məni də ki bu andır azar tərpənməyə qoymur, – dedi.* Çəmənzəminli.

**ANDIRMAQ** *f.* 1. Anlatmaq, başa salmaq, qandırmaq. *Payız gəlib xəzandır; Xəzan pərgar pozandır; Ürəkdə bir dərdim var; El-obaya yaz, andır.* (Bayatı). *Yazdığın ta oxuyub andırsın; Mətləbin başqasına qandırsın.* A.Səhhət. *Naəhl olana mətləbi andırmaq olurmu?* M.Ə.Sabir.

2. Xatırlatmaq, yada salmaq, oxşar kimi görünmək. *Toxunmadan sızıltılı çıxan həzin naləsi; Əldən düşmüş bir sınıq saz olduğunu andırır.* A.Səhhət. [Kor kişinin] *əlbisəsinin tərzi, biçimi, üzünün xətləri aciz və bacarıqsızlığını andırırdı.* S.Hüseyn. *Bir az əvvəl ildırımlı gecələri andıran o gözlər .. təlatümə gəlmiş bir dəniz kimi qaynadı.* Ə.Məmmədxanlı.

**ANDIZ** *is. bot.* Xalq təbabətində dərman kimi işlənilən bitki. *Andız kökündən bəlğəmgətirici dərman hazırlanır.*

**ANDIZLIQ** *is.* Andız bitən yer.

**ANDLAŞMA** "Andlaşmaq"dan *f.is.*

**ANDLAŞMAQ** *qarş.* Bir-birinə ürək qızdırıb inanmaq və bel bağlamaq haqqında bir-birinə təntənəli söz vermək, əhdləşmək.

**ANDLI** *sif.* And içərək üzərinə müəyyən vəzifə və s. götürmüş, and içmiş. *Andlı iclasçılar institutu.*

**ANEKDÓT** [*yun.*] Gülməli və məzəli bir hadisə haqqında uydurma qısa hekayə; lətifə. *Anekdot danışmaq.*

**ANƏN** *zərf* [*ər.*] Birdən, gözlənmədən; bir anda, dərhal. *Anən gəldi.*

**ANGÍNA** [*lat.*] *tib.* Əsnəyin selikli qişasının və xüsusən badamcıqların iltihabı. *Angina oynaq, böyrək və ürək xəstəliyinə səbəb ola bilər.*

**ANILMA** "Anılmaq"dan *f.is.*

**ANILMAQ** *məch.* Yada salınmaq, xatırlanmaq, yad edilmək. *Yazıçının xatirəsi anıldı.*

**ANIŞ** *is. qəd.* İstək, arzu, dilək. *Gecəgündüz mənim anışım budur; Görüm Huri Pəhləvandan ayrılsın.* (Qoşma).

**ANİ** *sif.* Ən az, ən qısa bir zamanda olan; bir anda, göz yumub açınca olub keçən. *Ani təsir. Ani sükut. Ani ölüm. – Bizim bu ani tanışlığımızın ömrü bir-iki saatlıq söhbətdən ibarət olacaqmı?* M.S.Ordubadi. *Nəriman bu baxışlarda da öz ürəyindən keçənləri duydu, lakin bu çox ani* (z.) *oldu.* Mir Cəlal. *Musa kişi susaraq ani bir fikrə getdi.* M.İbrahimov. // Müvəqqəti, keçici, tez keçən. // Qəfil, gözlənilməz. *Ani təərrüz.*

**ANİLİK** *is.* Bir an içində olan şeyin xassəsi, halı. // Müvəqqətilik, keçicilik. // Qəfillik, gözlənilməzlik.

**ANİMÍZM** [*lat.*] İbtidai insanların hər bir şeyin ruhu olduğuna inanması, təbiət qüvvələrinə və hadisələrinə ruhi isnad verməsindən ibarət etiqadı (*dini etiqadların ilk mənşəyi*). *Animizmin başlıca ideyası.*

**ANKÉT** [*fr.*] Qabaqcadan hazırlanmış suallara cavab almaq üçün sorğu vərəqəsi. *Anket doldurmaq.* – [Heybət:] *Ərizəmi oxudular. Anketimi oxudular. Sonra da başladılar sual verməyə.* M.Hüseyn.

**ANKLÁV** *is.* [*fr.*] Hər tərəfdən eyni bir dövlətin ərazisi ilə sərhədlənən və dənizlə sərhədi olmayan yer, torpaq. *Anklavın dəniz sahili olduqda ona yarım anklav deyilir.*

**ANQÁR** [*fr.*] Təyyarələrin saxlanması və cari təmiri üçün xüsusi tikili. *Anqarlar istifadəsinə görə daimi, müvəqqəti və yığılıb-sökülən ola bilər.*

**ANQIRIŞMAQ** *qarş.* Ağız-ağıza verib, hamısı birdən anqırmaq, bağırmaq; bağırışmaq. *Daxmaları yerə yatmış dağınıq kənddə eşşəklər anqırışır, xoruzlar banlaşır..* S.Rəhimov.

**ANQIRMA** "Anqırmaq"dan *f.is.*

**ANQIRMAQ** *f.* Bərk bağırmaq, böyürmək. *Eşşək anqıranda itin başı ağrıyar.* (Ata. sözü). – *Təlxəklər bütün kələklərini meydana qoydular: .. çaqqal kimi ulaşdılar, banladılar, anqırdılar, kişnədilər, .. xanın halına təfavüt eləmədi.* Çəmənzəminli.

**ANQIRTI** *is.* Eşşək səsi, eşşək bağırtısı. *Uzaqdan anqırtı səsi gəlir.* // Ümumiyyətlə, bərk səs, bağırtı. *İki yüz il idi ki, yatmışdım*

*Təbrizdə .. nə maşın çığırtısı, nə paroxod anqırtısı, nə fayton-araba tıqqıltısı* (*eşidirdim*). C.Məmmədquluzadə.

**ANQIRTMA** "Anqırtmaq"dan *f.is.*

**ANQIRTMAQ** *icb.* 1. Anqırmağa, qışqırmağa, bağırmağa məcbur etmək; bağırtmaq.

2. *məc. isteh.* Ağlatmaq, böyürtmək.

**ANQUT** *is.* 1. *zool.* Uzunboğazlı, ördəyə oxşar, tutqun qırmızı rəngli caydaq quş. *Anqut köçəri quşdur, lakin qışlayanları da olur.*

2. *məc. dan.* Uzun, iri gövdəli, iri sümüklü, yaxud arıqlıqdan sümükləri çıxmış adam haqqında. □ **Anquta dönmək, anqutu çıxmaq** – arıqlıqdan anqut kimi boğazı uzanmaq. *Arıqlayıb anquta dönmüşdür.*

3. *məc*. Həris, acgöz, çox iştahalı adam haqqında. □ **Anqut kimi udmaq** – qabağına qoyulan yeməyi acgözlüklə, tələsik qamarlayıb yemək.

**ANQUTBOĞAZ** *sif. dan.* Çox arıq; boğazı incəlmiş, uzunboğaz (adam haqqında).

**ANLADILMA** "Anladılmaq"dan *f.is.*

**ANLADILMAQ** *məch.* Başa salınmaq, qandırılmaq, bildirilmək.

**ANLAQ** *is.* Düşüncə, qanacaq, mərifət, dərrakə. [Ağa Qurban:] *Bizim bu yekəpapaqlarda anlaq nə gəzir, gedirlər bazara, gəlirlər evlərinə, bir az zəhrimar yeyib yıxılıb yatırlar və elə bilirlər ki, həyat sürürlər.* Ə.Haqverdiyev.

**ANLAQLI** *sif.* Düşüncəli, qanacaqlı, mərifətli, dərrakəli. *Anlaqlı adam. Anlaqlı uşaq.*

**ANLAQLIQ** *is. hüq.* Şəxsin öz hərəkətlərini ölçüb-biçmək və ya özünü idarə etmək qabiliyyəti. *Cinayət etmiş şəxsin anlaqlığı.*

**ANLAQSIZ** *sif.* Düşüncəsiz, qanacaqsız, mərifətsiz, dərrakəsiz. [Nizami:] *Qədim mədəniyyət tarixini unudan .. adamlara ya anlaqsız, yainki əcnəbi puluna satılan adamlar kimi baxırıq.* M.S.Ordubadi.

**ANLAQSIZLIQ** *is.* Düşüncəsizlik, qanacaqsızlıq, mərifətsizlik, dərrakəsizlik. *Anlaqsızlıq vəziyyəti.*

**ANLAMA** "Anlamaq"dan *f.is.*

**ANLAMAQ** *f.* 1. Başa düşmək, qanmaq, düşünmək, dərk etmək. *Sözün mənasını anlamaq. Bu söhbətdən heç bir şey anlamadım. – Çox nüktə var, sən anlamasan, anlar aşiqin!* M.Ə.Sabir. *Sadədil muzdur indi anladı ki, uzunboylu, qarabığlı müsafir xozeyin deyilmiş, oğru imiş.* S.M.Qənizadə.

2. Duymaq, sezmək, hiss etmək, başa düşmək. *Onlar bir-birini yaxşı anlayırlar. Ürəyindən keçəni dərhal anladım. – Qız artıq onu* [Firidunu] *özünə yaxın bir dost hesab edirdi. Bunu o, onun səmimi rəftarından anlayırdı.* M.İbrahimov.

3. Bir şey haqqında müəyyən fikri, baxışı olmaq. *Bunu mən başqa cür anlayıram. Sizcə, bunu necə anlamaq lazımdır? Mənim anladığıma görə.*

**ANLAMAZ** *sif.* Qanmaz, mərifətsiz, şüursuz, qanacaqsız; kobud. *Anlamaz adam.* // İs. mənasında. *Əğyar ilən çıxıb seyrə dərməsin; Layiq olmaz anlamaza bənövşə.* M.P.Vaqif.

**ANLAMAZLIQ** *is.* Qanmazlıq, şüursuzluq, mərifətsizlik, qanacaqsızlıq, kobudluq.

**ANLAŞIQLI** *sif.* Aydın, başa düşülən, hamının başa düşəcəyi şəkildə olan. *Biz .. hamının qəlbinə yol açan, aydın, anlaşıqlı və sadə bir dildə yazılmış şeirlər yaratmalıyıq.* S.Vurğun. ..*Əruzla aydın və anlaşıqlı bir dildə yazmağı bacarmaq lazımdır.* S.Rüstəm.

**ANLAŞILAN** *ara söz.* Yəqin ki, ehtimal ki, görünür ki.

**ANLAŞILMA** "Anlaşılmaq"dan *f.is.*

**ANLAŞILMAQ** *məch.* Başa düşülmək, dərk edilmək; məlum olmaq, aydın olmaq. *Onun sözlərindən heç bir şey anlaşılmadı. Danışığından anlaşıldı ki, bu gün yola düşəcəkdir. – Azərbaycan xalq musiqisi nəinki yalnız azərbaycanlılar tərəfindən anlaşılıb sevilir; o, bir çox xalqların qəlbinə yol aça bilir.* Ü.Hacıbəyov. *Alçaq, yastı və torpaq evlərdən buranın kiçik bir kənd xarabası olduğu anlaşılırdı.* Ə.Məmmədxanlı.

**ANLAŞILMAZ** *sif.* Başa düşülməyən və ya başa düşülməsi çətin olan, mənası aydın olmayan. *Anlaşılmaz söz. Anlaşılmaz fikir. Kütlə üçün yazılan kitablarda qəliz və anlaşılmaz sözlər işlətməməli. – Gecə yarısı avam camaat məclislərə dolub, mollanın ərəbcə dediyi anlaşılmaz ibarələri dinlər, sonra hər kəs evinə qayıdardı.* H.Sarabski. // İzah edilə bilməyən, səbəbi bilinməyən, qəribə, təəccüblü, müəmmalı. *Anlaşılmaz hadisə. Anlaşılmaz hərəkət. – İndi* [Züleyxa] *daxi-*

*lində anlaşılmaz bir narahatlıq, bir iztirab duyurdu.* M.İbrahimov. *Dərs otağına dərin və anlaşılmaz bir sükut çökmüşdü.* M.Hüseyn. *Nədən isə bu gecə qoca arxivçinin qəlbində sevinc ilə qarışıq anlaşılmaz bir hiss vardı.* H.Nəzərli.

**ANLAŞILMAZLIQ** *is.* 1. Anlaşılmaz şeyin halı.

2. Bir-birini anlamama, başa düşməmə, yaxud yanlış başa düşmə və bunun nəticəsində törəyən hal, keyfiyyət. [Qızıl Arslan:] *Aralıqda mövcud olan bütün anlaşılmazlıq, hətta bir para ixtilaflar da himayəsizlik nəticəsində yaradılmışdır.* M.S.Ordubadi.

**ANLAŞMA** "Anlaşmaq"dan *f.is. Sülhü möhkəmləndirmək üçün bütün imkanlardan istifadə edilir, dövlətlər arasında səmimi anlaşmaya və xeyirxah münasibətlər yaranmasına çalışılır.*

**ANLAŞMAQ** *f.* Bir-birini anlamaq, başa düşmək, bir-biri ilə razılaşmaq, sazişə gəlmək. *Lakin Toğrul Qızıl Arslanla anlaşmaq əvəzinə Azərbaycanda nüfuza malik olan tək-tək adamlarla anlaşmaq və əlaqəyə girməyi düşündü.* M.S.Ordubadi. *Soltan Ağaməmməd şahla anlaşıb, ona Qarabağda Rusiyaya qarşı çıxmağını tövsiyə edirmiş.* Çəmənzəminli.

**ANLATMA** "Anlatmaq"dan *f.is.*

**ANLATMAQ** *f.* Başa salmaq, qandırmaq, izah etmək. *Mən ki bilməz idim nədir məhəbbət; Bu sirri sən mənə anlatmadınmı?* M.Müşfiq.

**ANLAYAN** *f.sif.* Başa düşən, qanan, mərifətli, qanacaqlı, arif. *İşarət eylərəm anlayan dosta; Dostunun qədrini bilən oynasın.* M.P.Vaqif. *Kişi dövlətinə pasiban gərək; İşarə anlayan, söz qanan gərək.* Q.Zakir. // İs. mənasında. *Sübh vaxtında tez durub banlar; Anlayanlar işarəsin anlar.* S.Ə.Şirvani.

**ANLAYIŞ** *is.* 1. Anlaşma, qanma, düşünmə, dərk etmə işi; idrak, ağıl, zəka, fərasət.

2. Bir şey haqqında məntiqi cəhətdən formalaşmış ümumi fikir, təsəvvür; məfhum. *Bir-birinə zidd olan anlayışlar. İctimai sinif anlayışı.*

**ANLAYIŞLI** *sif.* Düşüncəli, fərasətli, zehinli, tez başa düşən, tez qavrayan.

**ANLI** *sif. qəd.* Ağıllı, düşüncəli. *Qan ilə oynamaz anlı kəslər; Kin ilə kükrəmədə varmı hünər?* A.Şaiq.

**ANMA** "Anmaq"dan *f.is. Anma mərasimi.*

**ANMAQ** *f.* Yada salmaq, xatırlamaq, yad etmək, yada gətirmək. *Nərgis gözünə nigah edərdi; Yarın gözün anıb ah edərdi.* Füzuli. *Keçən günləri ki, indi bu dəmlər; Dəli könül, əbəs anar, ağlarsan.* M.P.Vaqif. *Layiqli əməldi səhvi anmaq; Lakin əzabı olurmu danmaq?* Şəhriyar.

**ANÓD** [*yun.*] *fiz.* Müsbət elektriklə yüklü elektrod. *Anod şüaları.*

**ANÓFELES** [*yun.*] Malyariya (qızdırma) törədən ağcaqanad.

**ANONİM** [*yun.*] 1. Əsərlərində, məktubunda adını gizlədən müəllif.

2. Müəllifinin adı göstərilməyən əsər, məktub. ☐ **Anonim şirkət** *iqt.* – səhmlərinin üstündə sahibinin familiyası yazılmayan səhmdarlar cəmiyyəti.

**ANÓNS** [*fr.*] Gələcək qastrollar, tamaşalar, konsertlər və s. haqqında qabaqcadan yapışdırılan elan, afişa.

**ANORMÁL** *sif.* [*yun.* a – inkar əd. və *lat.* normal] Qeyri-normal, qeyri-təbii, ümumi qaydaya uyğun olmayan, ümumi qaydadan kənar. *Anormal hadisə. Anormal vəziyyət.* – [Rza bəy] *Həkimülmülk və Səlimini gözlədiyi zamanda da ruhən belə bir anormal vəziyyət içərisində idi.* M.İbrahimov.

**ANORMALLIQ** *is.* Qeyri-normallıq.

**ANRI** *zərf* və *sif. dan.* 1. O yan, o tərəf, o yana, o tərəfə. *Anrı gedirəm. – Anrı yanımda arvad səsi gəldi. Qulaq verdim, Ruqiyyə idi.* A.Divanbəyoğlu.

2. Xırım-xırda.

3. Artıq-əskik, yersiz.

◊ **Anrı-bəri çəkmək** – süründürmək, o tərəf-bu tərəfə çəkmək, uzatmaq. **Anrı-bəri etmək** – 1) yerbəyer etmək, yerləşdirmək; 2) baş qaçırmaq, süründürmək.

**ANSÁMBL** [*fr.*] 1. *mus.* Bir yerdə çıxış edən və bir bədii kollektiv təşkil edən çalğıçılar, oxuyanlar və oynayanlar dəstəsi. *Sazçı qızlar ansamblı. Mahnı və rəqs ansamblı.*

2. Dram, yaxud musiqi pyesinin artistlər tərəfindən birgə ifası. // Bir neçə iştirakçının birgə ifası üçün yazılmış musiqi əsəri.

3. *məc.* Bir bütöv şeyi təşkil edən hissələrin mütənasib, ahəngdar birliyi. *Şəhərlərimiz getdikcə gözəlləşir və yeni-yeni memarlıq ansamblları yaradılır.* "İncəsənət".

**ANSIZ** *sif.* və *zərf* Birdən, gözlənilmədən, qəfildən. *Ansız ölüm. Ansız hadisə.*

**ANSIZIN** b a x **ansız**. *Bu zaman ansızın qopan .. bir fırtınadan yer-göy sarsıldı.* A.Şaiq. *Ansızın çıxan bu ceyranı heç kəs ata bilmədi.* Çəmənzəminli. *Həmid gedəndən sonra ansızın dəhşətli bir xəzri başladı.* Ə.Məmmədxanlı.

**ANSIZLIQ** *is.* Gözlənilməzlik, nagəhanilik; birdən-birə, qəfildən olma.

**ANŞLÁQ** [*alm.*] Teatrda, kinoda, sirkdə və s.-də biletlərin satılıb qurtardığını bildirən elan. *O teatr ki, bir zaman yanından keçərkən camaat az qala gözünü yumardı, indi ağzına qədər doludur, bəzən teatr, tamaşaya iki gün qalmış anşlaq asmalı olur.* Ə.Haqverdiyev.

**ANTAQONÍST** [*yun.*] Bir-biri ilə barışmaz düşmən olan. *Antaqonist siniflər. Antaqonist və qeyri-antaqonist ziddiyyətlər.*

**ANTAQONÍZM** [*yun.*] Barışmaz ziddiyyət. *Sinfi antaqonizm. Antaqonizm daha kəskin şəkil alırdı.*

**ANTARKTÍK** *sif.* Antarktikaya aid olan; cənubi, qütbi.

**ANTÁRKTİKA** [*yun.*] *coğr.* Yer kürəsinin cənub qütbü sahəsi. *Antarktikanın bitkisi zəif inkişaf etmişdir.*

**ANTÉNA** [*lat.*] Radio qurğusunun elektromaqnit dalğalarını yaymaq (radio verilişində) və ya onları tutmaq (qəbul etdikdə) üçün məftillər sistemi. *Antenanın işləmə nəzəriyyəsi və quraşdırılma metodları.*

**anti...** [*yun.*] Bir sıra xarici sözlərin (isim və sifətlərin) qabağında, onlara əkslik və zidlik mənası verən önlük, məs.: *antizərrəcik, antitezis, antisistem.*

**ANTİBİOTÍK** *sif.* [*yun.*] *biol. tib.* Mikrobların artıb törəməsinin qarşısını alan, yaxud onları öldürən antibiotik maddələr.

**ANTİBİÓTİKLƏR** *cəm, biol. tib.* Bəzi mikroorqanizmlərin ifraz etdiyi, bu və ya başqa mikrobların artıb törəməsinin qarşısını alan, yaxud onları öldürən kimyəvi maddələr. *Antibiotiklər müasir təbabətdə geniş surətdə dərman kimi* (*penisillin, streptomisin və s.*) *işlədilir.*

**ANTİFAŞÍST** [*yun.* anti... və *ital.* faşist] 1. Faşizmin düşməni, faşizmlə mübarizə iştirakçısı.

2. *sif.* Faşizm əleyhinə yönəldilmiş, faşizmlə mübarizə aparan. *Antifaşist təşkilatlar. Antifaşist hərəkatın üzvləri.*

**ANTÍK** *sif.* [*lat.*] Qədim. Qədim yunan və Roma ictimai quruluşuna, mədəniyyətinə, incəsənətinə aid olan. *Antik koloniyaların dövlət quruluşu. Antik fəlsəfə. Antik ədəbiyyat.*

**ANTİNÓMİYA** [*yun.* antinomia] *fəls.* Mühakimənin gedişində bir-birinə zidd, lakin eyni dərəcədə əsaslandırılmış hökmün meydana gəlməsi. *Semantik antinomiyalar. Antinomiya anlayışı antik dövrdə meydana gəlmişdir.*

**ANTİSEMÍT** [*yun.* anti... və *xüs.* semit] Yəhudi düşməni; yəhudiləri sevməyən, onlara nifrət və ədavət bəsləyən adam.

**ANTİSEMİTÍZM** [*yun.* anti... və *xüs.* semit] Yəhudilərə qarşı ədavət, düşmənçilik, nifrət. *Antisemitizm səlib səfərləri zamanı geniş şəkil almışdı.*

**ANTİSEPTÍK** *sif.* [*yun.*] *tib. kim.* Mikrobların inkişafına mane olan. *Antiseptik maddələr. Antiseptik vasitələr. – Təbabətdə mixək yağı .. diş xəstəliklərinin müalicəsində antiseptik dərman kimi işlədilir.* Əliyev.

**ANTİSÉPTİKA** [*yun.*] *tib.* 1. Mikrobları öldürən kimyəvi maddələr vasitəsilə yaraları mikroblardan qoruma və zərərsizləşdirmə üsulu.

2. Bu məqsəd üçün işlədilən dərmanlar, preparatlar.

**ANTİSOVÉT** *sif.* [*yun.* anti... və *rus.* sovet] Sovet hökuməti əleyhinə yönəldilmiş, ona düşmən olan. *Antisovet şüarlar.*

**ANTİTÉZA** [*yun.*] 1. Təzad, zidlik, əkslik. // *ədəb.* Bir-birinə zidd məfhum və surətlərin qarşılaşdırılmasından ibarət stilistik üsul. *Antitezadan əsərin sərlövhəsində də istifadə edilə bilər.*

2. B a x **antitezis.**

**ANTİTÉZİS** [*yun.*] *fəls. mənt.* İnkişaf prosesində əsas müddəanın inkarı; tezisə

qarşı qoyulan müddəa. *Antitezis Hegel triadasının ünsürlərindən biridir.*

**ANTOLÓGİYA** [*yun.*] *ədəb.* Müxtəlif yazıçıların əsərlərindən (əsasən, şeirlərindən) ibarət seçilmiş əsərlər məcmuəsi. *Azərbaycan şeir antologiyası.*

**ANTÓN**: **anton alması** [*xüs. is.*-dən] – payızda yetişən yaşıl-sarı rəngli, turşməzə alma növü. *Miçurin 1893-cü ildə meyvələrinin hər biri altı yüz qram gələn anton almasının toxumlarını əkdi.* M.Axundov.

**ANTÓNİM** [*yun.*] *dilç.* Başqa sözə qarşı əks məna daşıyan söz. *Antonimlər fikrin oxucuya qabarıq çatmasına kömək edir.*

**ANTRÁKT** [*fr.*] 1. Tamaşanın pərdələri, yaxud konsertin hissələri arasında fasilə, tənəffüs.

2. Opera, balet və ya dram tamaşalarının ayrı-ayrı pərdələri arasında ifa edilən musiqi əsəri.

**ANTROPOLÓGİYA** *is.* [*yun.*] İnsanın və insan irqinin mənsub fiziki təşəkkülü və təkəmmülü haqqında elm. *Antropologiyanın tədqiqat metodu.*

**ANTROPOLOJİ́** *sif.* Antropologiyaya aid olan. *Antropoloji tədqiqat. Antropoloji prinsip.*

**ANTROPÓLOQ** [*yun.*] Antropologiya mütəxəssisi.

**ANTROPOMORFÍZM** [*yun.* anthropos – insan, morphe – forma] İnsana xas olan xassə və xüsusiyyətlərin xarici təbiət qüvvələrinə köçürülməsi və bunların uydurma əfsanəvi varlıqlara aid edilməsi. *Dində antropomorfizmin əhəmiyyətini Feyerbax daha dərin və dolğun göstərmişdir.*

**AÓRTA** *is.* [*yun.*] *anat.* Ürəyin sağ mədəciyindən çıxan və bədənin (ciyərlərdən başqa) bütün üzvlərini arterial qanla təchiz edən ən böyük qan damarı; şah damar. *Aortanın divarı. Aortanın qalxan hissəsi.*

**APAÇIQ** *sif.* və *zərf* Tamamilə açıq, tamamilə aydın. *Apaçıq məsələ. Bütün əlamətlər bu yerlərdə neft yataqları olduğunu apaçıq göstərir. – Həsən kişinin həyəti, ağalıq damın üstündən apaçıq görünür.* Ə.Haqverdiyev. *Mağara o qədər kiçik idi ki, ayı potası apaçıq görünürdü.* A.Şaiq.

**APAĞ** *sif.* Tamamilə ağ, lap ağ, ağappaq. *Apağ süfrə. Apağ sifət.*

**APARÁT** [*lat.*] 1. *tex.* Alət, cihaz, qurğu. *Radio aparatı. Aparatla əyirmə.*

2. İdarə və ya təsərrüfatın müəyyən sahəsində xidmət edən müəssisələrin məcmusu. *Dövlət aparatı.* // Bir idarənin və ya təşkilatın bütün işçiləri, ştatı.

3. *fiziol.* Orqanizmin hər hansı fəaliyyətini təmin edən üzvlər.

◊ **Elmi aparat** – elmi işdə müəllifin istifadə etdiyi vəsait və materiallar (göstəricilər, biblioqrafiya, lüğətlər, şərhlər və s.).

**APARATÇI** *is. xüs.* Aparatda işləyən, aparatı idarə edən fəhlə. *Aparatçılar briqadiri təcrübə sahəsində tökmə üsulu ilə hazırlanmış maşınların istilik rejimini yoxlayır.* (Qəzetlərdən).

**APARICI** *sif.* 1. Başda gedən, irəlidə gedən, qabaqda gedən. // Əsas, baş, ən mühüm. *"Rast" ladının mayəsinə bütün pərdələr tabedir: alt kvarta, alt medianta, alt aparıcı ton, üst aparıcı ton, tersiya, üst kvarta, kvinta.* Ü.Hacıbəyov. *Burada* [elm və təhsil yollarında] *şəxsi hünər, səy və zəhmətin aparıcı olduğu da yəqin edilirdi.* S.Rəhimov.

2. *tex.* Mühərrik tərəfindən hərəkətə gətirilən və hərəkəti mexanizmin başqa hissələrinə keçirən. *Aparıcı təkərlər. Aparıcı ox.*

3. Radio və televiziya verilişlərində mətnin müəllifə aid və ya izahedici sözlərini söyləyən adam.

**APARILMA** "Aparılmaq"dan *f.is. Yüklərin vaxtında aparılmasını təmin etməli.*

**APARILMAQ** "Aparmaq"dan (1, 2, 3, 8 və 12-ci mənalarda) *məch. Sərnişinlərin hamısı yerlərinə aparıldı. Mübarizə aparılmaq. Təşviqat aparılmaq. – Raya özünün haraya və kimin evinə aparıldığını bilmirdi.* M.S.Ordubadi. [Allahqulu:] *Oğlumun haraya aparıldığını bilmirəm.* Ə.Haqverdiyev.

**APARMA** "Aparmaq"dan *f.is.*

**APARMAQ** *f.* 1. Bir şeyi əlinə götürərək, yaxud dalına yükləyərək bir yerdən başqa yerə köçürmək, gətirmək. *Uşağı qucağında aparmaq. Yükü dalında aparmaq. Tayı çiynində aparmaq. – Həkimin nüsxəsini heç dərmanxanaya aparmadım.* Mir Cəlal. // Daşımaq, nəql etmək. *Avtobus minikləri apardı. Qatar çoxlu yük apardı. Qarışqa*

*dən aparır. – Səhiyyəçilər yaralıları aparırdılar.* Mir Cəlal.

2. Birinin hərəkətini yönəltmək, yol göstərmək; özü ilə bərabər yeriməsinə kömək etmək, yaxud getməyə məcbur etmək, özü ilə bərabər gətirmək. *Uşaqları teatra aparmaq. Qocanın qolundan tutub aparmaq.*

3. Özü ilə bərabər götürüb getmək. *Kötüyü su apardı. – Gördü bir kəllə su üzündə əyan; Aparır çay aşağı seyli-rəvan.* S.Ə.Şirvani. *Ciğato çayı minlərlə .. malqara cəmdəklərini axıdıb Urmu gölünə aparırdı.* M.S.Ordubadi.

4. Oğurlamaq, çalmaq, qaçırmaq, çırpışdırmaq, alıb qaçmaq. *Əzizim, nə xandılar; Nə sultan, nə xandılar; Apardılar yarımı; Tayfalıqca dandılar.* (Bayatı). [Pristav:] *Bu kasıb bədbəxtin öküzünü aparıbsan, binəvanı əli qoynunda qoyubsan.* Ə.Haqverdiyev. [Dəyirmançı:] *Varımı-yoxumu apardılar, bilirsən ki, əkinim yox, biçinim yox, şahada dolanıram, yeyənim də yeddi başdır.* Çəmənzəminli.

5. *məc.* Udmaq, qazanmaq, qalib gəlmək (oyunda, məhkəmədə və s.-də). *İki oynayanın biri aparar. Məhkəmədə işi hansı tərəf apardı? – Kim oxusa, aparıbdır.* Mir Cəlal. [Sərvinaz Firuzəyə:] *Çəkişmirəm, aparsam da verməyəcəksən, cığalın birisən.* İ.Əfəndiyev.

6. *məc.* Yox etmək, silib təmizləmək, çıxarmaq. *Ləkəni aparmaq. Paltarın ləkəsini benzinlə aparmaq olar.*

7. *məc.* Məhv etmək, yox etmək, puç etmək, xarab etmək, dağıtmaq. *Bəndi sel apardı. Dolu bütün meyvələri apardı. Əkinləri don apardı.*

8. Sərf edilməsinə, işlənməsinə səbəb olmaq; əlindən almaq. *Bu iş beş gün vaxtımı apardı.* – [Kərim:] *Bir quyunun qazılmasına gedən vaxtın yarıdan çoxunu başqa işlər aparır.* M.İbrahimov.

9. *məc.* Qoparmaq, yemək, kəsmək; sürtüb aparmaq, xarab etmək. *Barmağının başını maşının çarxı apardı. Daş ülgücün ağzını aparıb.*

10. Həyata keçirmək, yeritmək, etmək. *Mübarizə aparmaq. Müharibə aparmaq. Təbliğat aparmaq. – İş apar, baş gedərsə qoy getsin; Ad qalır, bəs deyilmi millət ilə.* M.Ə.Sabir.

11. İdarə etmək, başda durmaq, başçılıq etmək, rəhbərlik etmək. *Əsgərləri yürüşə aparmaq. Məclis aparmaq bacarıq istəyir.*

12. *məc.* Bihuş etmək, məst etmək; yuxulatmaq, bayıltmaq. *Musiqinin səsi məni apardı. – ..Oğlanı dərd apardı; Dərmanı qızda qaldı.* (Mahnı).

13. Aparıb çıxarmaq, gətirib çıxarmaq, yönəltmək. *Bu yol haraya aparır?* // *məc.* Sürükləmək, səbəb olmaq, gətirib çıxarmaq. *Fəlakətə aparmaq.*

14. Bir sıra isimlərə qoşularaq mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: yuxu aparmaq, ləzzət aparmaq, fikir aparmaq, qan aparmaq.

15. "Özünü" sözü ilə birlikdə – özünü idarə etmək, bir qaydada hərəkət etmək. *Özünü yaxşı aparmamaq. Özünü rəsmi aparmaq. – ..Aslan özünü bu gün çox soyuqqanlı və səbirli aparırdı.* M.İbrahimov. [Kərim] *həmişə özünü bir ağsaqqal kimi aparır, elin işinə yarayır, onun körpüsünü tikir, dəyirmanını düzəldirdi.* S.Rəhimov.

**APARTMAQ** *icb.* Aparmağa məcbur etmək.

**APAŞKAR** b a x **apaydın.**

**APAYDIN** *sif.* Tamamilə aydın, tamamilə bəlli. *Apaydın məsələ. Apaydın hava. – Qəhrəmanın üzündə ümidsizlik və tərəddüd əlamətləri apaydın görünməkdə idi.* Ə.Vəliyev.

**APELLYÁSİYA** *is.* [*lat.* appellatio – müraciət] *hüq.* Məhkəmənin qanuni qüvvəyə minməmiş qərarlarından yuxarı instansiyaya şikayət vermə qaydası. *Apellyasiya məhkəməsi. Apellyasiya qaydasında qəbul olunan qərar.*

**APLİKÁSİYA** *is.* [*lat.*] Qurama, ornamentlərin yaradılması üsulu.

**APÓRT** [*xüs. is.*-dən] Alma ağacı növü və bu ağacın çox qalan turşməzə-şirin iri alması. *Aport özünü yaxşı tozlamır.*

**APOSTRÓF** [*yun.*] *dilç.* Sözlərdə buraxılan səsi əvəz etmək üçün hərflərin arasında üstdə qoyulan vergül şəkilli işarə ('). *Apostrof işarəsinin atılması.*

**APPENDİSÍT** [*lat.*] *tib.* Kor bağırsağın artımının iltihabı. *Appendisit tutmaları.*

**APRÉL** [*lat.*] Təqvim ilinin dördüncü ayı. *Aprel ayının ilk günləri.*

**APRİÓR(İ)** [*lat.*] *fəls.* Təcrübədən və təcrübənin nəticəsindən asılı olmayaraq. *Aprior bilik.*

**APROBÁSİYA** *is.* [*lat.*] 1. Bəyənmə, təsdiqetmə.

2. Keyfiyyəti təyin etmə. *Aprobasiya metodikası.*

**APTÉK** [əsli *yun.*] Həkimlərin resepti üzrə dərman hazırlayıb satan müəssisə; dərmanxana, əczaxana. *Aptek ilk dəfə 754-cü ildə Bağdad şəhərində yaradılmışdır. – Aptekdən təzə dərman gətirmişdilər.* C.Məmmədquluzadə.

**APTEKÇƏ** *kiç.* İlk tibbi yardım göstərmək üçün lazım olan dərmanlar toplusu və içində bu cür dərmanlar olan qutu. *Hər bir düşərgədə – çardaqda ilk yardım göstərmək üçün baytarlıq aptekçəsi olmalıdır.*

**APTEKÇİ** *is.* 1. Həkimin resepti ilə dərman hazırlayan aptek işçisi; əczaçı. *..Qız stol başında aptekçilər kimi dərmanlar əhatəsində oturmuşdur.* Mir Cəlal.

2. *köhn.* Aptek sahibi. *Bir rus aptekçisinə izn verilib qiraətxana açsın.* C.Məmmədquluzadə.

**APTEKÇİLİK** *is.* Aptekçi sənəti, işi; əczaçılıq.

**AR** *is.* [*ər.*] 1. Həya, abır, utanma; namus, qeyrət, izzəti-nəfs, mənlik. *Bu adamda heç ar deyən şey yoxdur. – Görür əğyar ilə yarini, ölməz; İlahi, Seyyidə bir ar gəlsin.* S.Ə.Şirvani.

2. Eyib, utanılacaq şey, nöqsan. *Nə etmək, mən fəqirəm, yar sultan; Mənə yar olmasından arı vardır.* Heyran xanım. *Mən bu arı heç vaxt qeyrətimə sığışdıra bilmədiyim üçün, onun təklifini rədd etmədim.* M.S.Ordubadi. *Qafil yaşamaqdansa, gözəl kardır ölmək; Hərçənd ki, qəflətdə dəxi ardır ölmək.* M.Ə.Sabir. ◻ **Ar bilmək** – özü üçün əskiklik, eyib bilmək, izzətinəfsini gözləmək. *Mən bu hərəkəti özümə ar bilirdim. – Könül, ol mahliqa söhbətimiz ar bilir; Ki, özün ülfəti-əğyarə səzavar bilir.* S.Ə.Şirvani. *Tahir qorxsa da, ustanın təklifindən boyun qaçırmağı özünə ar bildi.* M.Hüseyn. *Uşaq ufuldadısa da, üzündəki xoş ifadəni pozmağı özünə ar bildi.* Mir Cəlal. **Ar etmək** – utanmaq, həya etmək, xəcalət çəkmək. *Çağırılan yerə ar eləmə, çağırılmayan yeri dar.* (Ata. sözü). *Söhbətimdən ar edib, ey gül, məni tərk etmə kim; Gül olur əfsürdə tərki-söhbəti-xar eyləgəc.* Füzuli. **Ar olmaq** – eyib olmaq. *Bir də baxmaq mənə ar oldu sənə; Başqa bir cəzbəli yar oldu sənə.* M.Ə.Sabir. **Arı yemək** – həyasızlaşmaq, abır-həyasını itirmək, arsızlaşmaq, heç şeydən utanmamaq. *Arı yeyib namusu dalına alıb.* (Ata. sözü). **Arına gəlmək** – b a x **ar etmək.** [Sadıqov] *Qoy nə edir etsin. Ancaq camaat içində arıma gəlir.* İ.Əfəndiyev.

**ARA** *is.* 1. İki nöqtə, iki şey arasındakı məsafə. *Bakı ilə Gəncə arasında asfalt yol var. Məktəblə evimizin arası yüz addım olar. – Qulam Əsgərov düşmən ilə öz aralarındakı məsafəni bilirdi.* Ə.Əbülhəsən.

2. Boşluq, açıqlıq, boş yer, açıq yer, məsafə. *Ara qoymaq. Qapını yaxşı ört, ara qalmasın. Pəncərənin arasından külək gəlir. Çəpərin arasından baxmaq. – Sona elə ki geyinib hazır oldu, qapının arasından baxdı.* N.Nərimanov.

3. İki hadisə, iş, əhvalat və s. arasındakı müddət, vaxt. *Məktəbə girməyim ilə bitirməyimin arası 4 il çəkdi.* // Fasilə. ◻ **Ara vermədən** – dayanmadan, arası kəsilmədən, fasiləsiz. *Ara vermədən danışmaq. – Dəniz ara vermədən buruğun polad sütunlarını döyəcləyirdi.* M.İbrahimov. *Burada Nuru oğlu sözünə ara vermədən şəhadət barmağı ilə qaranı göstərdi..* M.Hüseyn. **Ara vermək** – dayanmaq, kəsilmək, fasilə vermək, müvəqqəti olaraq arası kəsilmək. *Yağış ara verdi. – Ancaq quduz xəzri dəqiqədəqiqə ara verib, damlar başında uluyurdu.* S.M.Qənizadə. *Bəyin divanı ara verəndə zurnaçılar başlayırdı.* Mir Cəlal. **Ara verməmək** – kəsilməmək, dayanmamaq. *Yağış ara vermir.* **Arası kəsilmək** – b a x **ara vermək.** *Selin arası kəsildi. Sürünün arası kəsildi. – Uzun illər kəsilməyir arası; Şamü səhər, leylü nahar ağlarsan.* M.P.Vaqif. *Dilarənin leytenant Əjdərdən aldığı məktubların arası kəsilmişdi.* Ə.Məmmədxanlı.

4. Hüdud, sərhəd; iki torpağı, mülkü və s.-ni bir-birindən ayıran xətt, mərz. *İki bağın*

*arasında çinar ağacları əkilmişdi. Həyətlərin arasında hasar çəkilibdir.*

5. İçəri, orta, ortalıq. *Taxılın arasında lalələr bitmişdir. Yüzlərcə kitab arasından bircəsini seçdim. Alimlər arasında mübahisə. – ..Bu gün əhali arasında və ruznamələrdə ikinci kitab haqqında böyük danışıqlar başlanmışdı.* M.İbrahimov. *Günəş parça-parça ağarışan buludlar arasından süzüb çıxdıqca hava daha da istiləşir.* M.Hüseyn.

6. *məc.* Əlaqə, münasibət, rəftar. *Yar məndən kəsməzdi belə aranı; Bu qoymayan kimdir, barı görəydim.* M.P.Vaqif. *Yəqin ki, bizlərdən olmuş bədgüman; Kəsildi yol, belə bağlandı ara.* M.F.Axundzadə.

7. İç, qat, büküm. *Çörəyin arasına pendir qoymaq. Palazın arasını açmaq. Kitabın arasına nişan qoymaq. Qələm dəftərin arasındadır.*

8. Yer. halda: **arada** – 1) b a x **ara yerdə**. *Arada bağrı parçalanan, yanan, tüstüsü göyə qalxan kababdır.* Mir Cəlal; 2) işin arasında. *Arada bir bizə dəy.*

9. Çıx. halında: **aradan** – bir işin, hadisənin üstündən. *Aradan bir gün keçdi. Həmşərimi daha küçədə görmədim.* C.Məmmədquluzadə.

◊ **Ara açmaq** – 1) qiymət kəsmək, satış şərtlərini müəyyən etmək; 2) aranı düzəltmək, münasibəti düzəltmək, yaxşılaşdırmaq. **Ara dəymək** – küsüşmək, əlaqə və dostluq pozulmaq. *Əvvəlləri onunla aram dəymişdi, bir dəfə sözünə cavab qaytarmışdım.* **Ara düzəltmək** – barışdırmaq, vasitəçilik etmək, arada əlaqə düzəltmək. **Ara qarışdırmaq** – araya fitnə salmaq, pozğunluq, qarışıqlıq salmaq. [Səməd Nadirə:] *Ancaq beş-altı nəfər .. var, onlar aranı qarışdırırlar.* B.Talıblı. *Səmədin anası .. Gülpərini ara qarışdırmaqda, saman altından su yeritməkdə .. təqsirləndirirdi.* M.Hüseyn. **Ara qarışıb məzhəb itmək** – b a x **ara qarışmaq**. *Məsələ məlum olduqda, necə deyərlər, ara qarışıb məzhəb itərdi..* H.Sarabski. **Ara qarışmaq** – nizamsızlıq düşmək, qarışıqlıq düşmək, qayda-qanun pozulmaq, hərc-mərclik düşmək. *Gah küsülü olub, gahı barışıb; Bir saat keçməmiş ara qarışıb; Tənəli-tənəli sözlər danışıb; Əlini dizinə çatdığın yetər.* Q.Zakir. **Ara qatmaq** – b a x **ara qarışdırmaq.** *Bir-iki nəfər aranı qatmaq üçün hökumətə donos verdilər..* H.Sarabski. **Ara qırmaq** – b a x **ara vurmaq. Ara pozmaq** – b a x **ara vurmaq. Ara pozulmaq** – b a x **ara dəymək**. **Ara sayxaşmaq (sakitləşmək)** – sakitlik düşmək, səs-küy kəsilmək. *Məclis dağıldı, ara sayxaşdı. – Budur, daha ara sayxaşdı, toz-duman çəkilir.* A.Səhhət. **Ara sazlamaq** – b a x **ara düzəltmək. Ara soyumaq** – əlaqə kəsilmək, dostluq pozulmaq. **Ara söz, ara cümlə** *qram.* – danışanın haqqında danışılan şeyə münasibətini ifadə etmək üçün cümlə içərisinə daxil edilən söz, ya cümlə, məs.: əlbəttə, ola bilsin, daha doğrusu, yəqin ki və i. a. **Ara sözü (söhbəti)** – şayiə, yalan xəbər, uydurma. *Ara sözü ev yıxar.* (Məsəl). **Ara vurmaq (vuruşdurmaq, pozmaq)** – yoldaşlar, dostlar və s. arasında nifaq, düşmənçilik salmaq, dalaşdırmaq, əlaqələrini pozmaq. **Ara yerdə** – arada, aralıqda, ortalıqda, nahaq yerə. *Üzünü güzgüyə qeybətdə oxşadan qafil; Toxunsa üz-üzə, olmazmı ara yerdə xəcil.* Füzuli. *Ara yerdə başıma qopmuş qiyamətlər mənim.* M.P.Vaqif. **Ara yerdə qalmaq** – yiyəsiz, sahibsiz, kimsəsiz, əlacsız qalmaq, hər şeydən əli çıxmaq. **Arada gəzmək** – araya fitnə salmaq məqsədi ilə xəbərçilik etmək və söz aparıb gətirmək, ara qarışdırmaq. **Arada qalmaq** – 1) aralıqda qalmaq, hər şeydən əli çıxmaq; 2) mütərəddid qalmaq, nə edəcəyini bilməmək. **Aradan çıxarmaq** – qurtarmaq, xilas etmək, çətin vəziyyətdən qurtarmaq. *Lazım gəldiyi vaxt Tütünçüoğluna silahla da yardım göstərəcək və onu aradan qaldıracaq idi.* M.S.Ordubadi. **Aradan çıxmaq** – canını qurtarmaq, çətin vəziyyətdən qurtarmaq, yaxa qurtarmaq, qaçmaq, qaçıb gizlənmək; // gözdən itmək, yox olmaq. **Aradan qaldırmaq (götürmək)** – yox etmək; ləğv etmək, ortadan qaldırmaq. **Araları dəymək (sərinləşmək)** – küsüşmək, əlaqələri pozulmaq. **Aranı saz eləmək** – dostlaşmaq, lap yaxınlaşmaq. **Aranı vurmaq (kəsmək)**

– əlaqəni kəsmək, küsmək. *Kəsibən bizimlə aranı nədən; Nə müddətdən bəri yox gedib-gələn.* Q.Zakir. **Arası açılmaq** – 1) yaxınlaşmaq, dostlaşmaq. *O şəndir, Sübhanverdizadə ilə arası açılmağına çox sevinir.* S.Rəhimov; 2) pozuluşmaq, arası dəymək. *Cavad xanla İraklinin arası açıldığı üçün İrakli Cavad xanı götürüb yerinə Rəhim xanı keçirmək istəyirdi.* Çəmənzəminli. **Arası kəsilmədən –** dayanmadan, durmadan, fasiləsiz, aramsız. **Arası kök olmaq** – b a x **arası olmaq** 2-ci mənada. *Bundan sonra bir ayrısı başlayırdı: – Rəhmətlik xanın mənnən də arası çox kök idi. Zorxanada işləyəndə xan da bizimlə işləyirdi.* Çəmənzəminli. **Arası olmaq** – 1) xoşlamaq, istəmək, sevmək, arzu etmək, həvəsi olmaq. *Onun şirni ilə çox arası var*; 2) əlaqəsi, dostluğu olmaq. **Arası olmamaq** – xoşlamamaq, sevməmək, zəhləsi getmək. *Nədənsə, divar yazan uşaqlarnan mənim aram yoxdur.* C.Məmmədquluzadə. *Mənim onlarla qədimdən aram yoxdur*. S.S.Axundov. [Əzim dayı] *yalan, riyakarlıq nə olduğunu bilməz və belə adamlarla heç arası olmazdı.* A.Şaiq. **Arası saz olmaq** – b a x **arası olmaq.** [Katib] *daldaya gələndə isə, əziz dostu, arası saz olduğu əməli katibin dediklərini xatırlardı.* Mir Cəlal. **Araya almaq** – dövrəyə almaq, ortalığa almaq, dövrələmək, ətrafını almaq. [Qorodovoylar] *Məhərrəmi araya alaraq qapıdan çıxdılar.* H.Nəzərli. *Bu aralıq qadınlar da yetişib arabamızı araya aldılar*. A.Şaiq. **Araya atmaq** – ortalığa atmaq, irəli sürmək, meydana atmaq. **Araya düşmək** – vasitəçilik etmək, vasitəçi olmaq. *Saqi oldun, sən ki, düşdün araya; Dəxi bu məclisdən ayılan olmaz.* Q.Zakir. **Araya gəlmək** – ortalığa gəlmək, ortaya qoyulmaq. *Süfrə yığıldı, araya çay gəldi.* “Aşıq Qərib”. **Araya girmək** – 1) b a x **araya düşmək**; 2) bir-biri ilə bəhs edən və ya küsüşən adamlar arasına girib, onları daha da qızışdırmaq. **Araya qoymaq** *məc.* – ələ salmaq, oynatmaq, masqaraya qoymaq, lağa qoymaq. **Araya soxulmaq** – müdaxilə etmək, qarışmaq. **Araya söz salmaq** – mübahisə qalxmasına səbəb olmaq, mübahisə törətmək. **Bu ara, bu arada** – bu zaman, bu anda, bu dəmdə. *Möhnətimə çarə, dərdimə dərman; Edən yoxdu, bu arada, gedirəm.* Q.Zakir. *Lərzə düşdü bədənimə bu ara.* M.Rahim. **Öz aramızdır** – məxfi, gizli, yalnız müsahiblər arasında qalmalı sirr, söhbət haqqında. [Allahqulu:] – *Ay usta Kazım, – dedi, – öz aramızdır, bu xanlar elə il uzunu bir-biri ilə dava eləyirlər, kasıbkusub əldən gedir.* Çəmənzəminli.

**ARABA** *is.* İki və ya dördtəkərli nəqliyyat vasitəsi. *Minik arabası. Yük arabası. Əl arabası* (əl ilə sürülən araba). *İkitəkərli araba. – Arabanı at aparmır, arpa aparır*. (Məsəl). *Arabanı mindik və yarım saata gəldik çıxdıq Naxçıvana.* C.Məmmədquluzadə. *İkitəkərli araba qoşulub qapıya çəkilmişdi.* M.Hüseyn.

◊ **Araba ilə dovşan tutmaq** – 1) bir şeyi tədbirlə, hiylə və üsul ilə əldə etməyə çalışmaq; baş tutmayacaq bir işə girişmək; 2) çox ləng işləmək, bir işi çox ağır, yavaş görmək. **Buxar arabası** *köhn.* – parovoz. *Saat on iki tamamda buxar arabası acıqlı əjdaha kimi Balaxanı tərəfdən gözlərini ağardaraq, nərə vurmağa başladı.* S.M.Qənizadə.

**ARABABƏND** *is*. Araba qayıran usta.

**ARABACIQ** *kiç*. Kiçik araba. // Uşaq arabası, oyuncaq araba.

**ARABAÇI** *is*. 1. Araba sürən adam, araba işlədən adam. *Küçələrdə arabaçılar, suçular .. o yan-bu yana yeriməkdə idi*. S.M.Qənizadə. [Hacı:] *Arabaçı, dayan, babılarla yol getmək özü bir fitnə-fəsad işdir, saxla!* Mir Cəlal.

2. Araba qayıran, araba bağlayan usta.

**ARABAÇILIQ** *is*. Arabaçı sənəti, işi. *Kişi Nurəddinlə bərabər arabaçılığa getmişdi.* S.S.Axundov.

**ARA-BƏRƏ** *is. dan.* 1. Aralıq, ara, orta. *Köçün ara-bərəsində, tozun içində, qabağı öküz yüklü, arxası ağır şələli, boyunlarında uşaqları olanlar da qan-tər içində dartınıb .. gedirdilər.* S.Rəhimov.

2. Hüdud, sərhəd.

**ARABİR** *zərf* Hərdənbir, gahdanbir, bəzən. *Arabir yağış yağır. Arabir bizə gələrdi.* – [Kərim baba tüfəngini] *hər gün silər, təmizlər və arabir dərənin içinə enərək*

*bir yeri nişan alardı.* A.Şaiq. [Nadir] *yəqin etmişdi ki, özü Zeynəbə baxdığı kimi, Zeynəb də arabir gözaltı ona baxır.* B.Talıblı.

**ARAÇI** *is.* Ara düzəldən adam, dəllal. // Arada duran adam, vasitəçi. *Mahmud .. öz ürəyini soyutmaq istəyirdi. Lakin araçılar buna mane oldular.* P.Makulu.

**ARAÇILIQ** *is.* Vasitəçilik, miyançılıq, ara düzəltmə; dəllallıq. □ **Araçılıq etmək** – vasitəçilik etmək, ara düzəltmək.

**ARADABİR** b a x **arabir**.

**ARADÜZƏLDƏN** *is. dan.* Vasitəçi (yalnız mənfi mənada).

**ARAHƏKİMİ** *is.* Heç bir təhsili olmayan və qeyri-elmi üsullarla müalicə edən adam; türkəçarəçi.

**ARAKÇEYEVÇİLİK** *is.* [Rusiya çarı I Aleksandr dövründə nazir olmuş Arakçeyevin adından] 1. XIX əsrin əvvəlində Rusiyada: qeyri-məhdud polis istibdadı, hərbi zümrənin başlı-başınalığı və xalq üzərində cəbr və zülm rejimi.

2. *məc.* Bir ovuc adamın ictimai həyatın hər hansı bir sahəsində özbaşına və istədiyi kimi hökm sürdüyü bir vəziyyət.

**ARAKƏSİLMƏZLİK** *is.* Arasıkəsilməz şeyin halı, fasiləsizlik, davamlılıq, sürəklilik.

**ARAKƏSMƏ** *is.* Bir otağı, yeri, binanı iki yerə ayıran yüngül divar; aralığa çəkilən divar, taxta və s. *Evin arakəsməsi taxtadandır. Arakəsməni suvarmaq.* // Üzərinə parça çəkilmiş çərçivələrdən ibarət bükülən pərdə; şirma. [Ağabala] *Reyhanın otağındakı arakəsmə üstündən əyilər*(*di*). Mir Cəlal.

◊ **Arakəsməyə salmaq** – əhatə etmək, ətrafını almaq, bürümək, dövrələmək. [Odabaşı:] *Cəhənnəm əhli İblisi arakəsməyə salıblar.* Ə.Haqverdiyev. *Uşaq qaçır, Hümmət kişi əl götürmür. Dərə-təpəni aşır, hay salır, qabaqdan adamlar gəlir, arakəsməyə salıb tuturlar.* S.Rəhimov.

**ARAQ** *is.* [*ər.*] 1. Meyvədən və s.-dən çəkilən spirtli içki. *Tut arağı. Zoğal arağı. Araq çəkmək. – Ərəqlə badədir ol iki cövhər; Ki, yoxdur onlara dünyadə salis.* S.Ə.Şirvani. [Kərəmov:] *Bütün dünya qurulub araq şüşəsinin üstündə, bircə mən ora yerləşmirəm.* S.Rəhman.

2. Bəzi çiçək, gül və otların distilləsindən hasil edilən cövhər (çox vaxt xalq təbabətində dərman və ədviyyat kimi işlədilir). *Bədmüşk arağı. Quluncan arağı. Nanə arağı.*

**ARAQARIŞDIRAN** *sif.* və *is.* Fitnə-fəsad salan. [Pyotr:] [Vano] *bəlkə araqarışdıranlardandır, qəsdən göndərilib.* S.Rəhman.

**ARAQ-ÇAXIR** *top.* Spirtli içkilər.

**ARAQÇƏKƏN** *is.* 1. Araq çəkməklə məşğul olan adam.

2. Araq çəkmək üçün cihaz, alət və s.

**ARAQÇI** *is. dan.* 1. Araqçəkən, araq hazırlayıb satan adam.

2. Çox araq içən, içkilərdən ən çox arağı sevən adam.

**ARAQÇIN** *is.* [*ər.* ərəq və *fars.* çin] Qiymətli parçadan, çox vaxt tirmədən və s.-dən tikilib, üstü güləbətin (zərli) və ya ipək sapla naxışlanmış baş geyimi, təsək. [Xortdan:] *Restoran sahibi də başında araqçın, döşündə döşlük .. qazanlardan müştərilərin istədikləri xörəkləri çəkib verir.* Ə.Haqverdiyev. [Molla Qafar] *araqçını qaldırıb başına, sonra da gödək, boğazı naxışlı yun corablarını çıxarıb, ayaqlarına məs çəkdi.* S.Rəhimov.

**ARAQÇINLI** *sif.* Başında araqçın olan, başına araqçın qoymuş. *..Başı araqçınlı, uzun arxalıqlı Vaqif nə isə sayır, həm də gözünün ucu ilə ona* [Qızxanıma] *baxırdı.* Çəmənzəminli. *Göy döşəkcə üstündə oturan ağ araqçınlı molla cəld ayağa qalxıb, əmmaməsini başına qoydu..* Mir Cəlal.

**ARAQ-VARAQ: araq-varaq eləmək** – hərtərəfli axtarmaq, axtarılmayan yer qoymamaq. [Dostum] *bütün hökumət dairələrini bir-birinə çaxnaşdırmış, bütün şəhəri araq-varaq eləmişdi.* Qantəmir. *Əlində zənbil bazardan qayıdan Xanım Balacayevə içəriyə girə-girə: – Ay qız, dünyanı araq-varaq eləmişəm, – dedi, – sən də soxulmusan bu stansiyaya, mırt vurursan?* S.Rəhimov.

**ARALAMA** "Aralamaq"dan *f.is.*

**ARALAMAQ** *f.* 1. Bitişik, yaxud yan-yana duran şeyləri kənara çəkib bir-birindən ayırmaq, ayrı qoymaq. *Pəncərənin pərdəsini aralamaq. Kolları aralayıb yol açmaq.*

2. Açmaq. *Kitabı aralayıb baxmaq. Ağzını aralayıb bir söz demir.*

3. Zorla başqa-başqa tərəflərə çəkmək, kənara çəkmək, aralaşdırmaq. *Dalaşanları aralamaq. – Biz bir-birimizlə savaşardıq, .. yol adamları bizi gəlib aralardılar.* C.Məmmədquluzadə.

**ARALANDIRMA** "Aralandırmaq"dan *f.is.*

**ARALANDIRMAQ** b a x **aralamaq**.

**ARALANMA** "Aralanmaq"dan *f.is.*

**ARALANMAQ** *f.* 1. Bir-birindən ayrılmaq, uzaqlaşmaq. *Atlılar aralanaraq hərə bir tərəfə getdi. – Aralanır buludlar, təravətlənir otlar.* A.Səhhət. *Sədrəddin bəydən aralanandan sonra, indi iki gün idi ki, muzdur Məşədi Əsgər öz arvad və uşağı ilə rahatlanırdı.* S.M.Qənizadə. // Bir qədər kənara, yana çəkilib yol açmaq. *Adamlar aralanıb Tükəzbana yol verdilər..* B.Talıblı. // Uzaqlaşmaq. *Ayrı düşmüş vətənindən, elindən; Həmdərdindən aralanmış könlümü.* M.V.Vidadi. *Kənddən bir qədər aralananda, .. səhər havası ilə nəfəs alanda özünü dünyanın ən bəxtiyar adamı sayırsan.* Mir Cəlal.

2. B a x **ayrılmaq** 2-ci mənada. *Xanpəri keçmiş xatirəsindən çətinliklə aralandı.* Ə.Vəliyev.

3. Çatlamaq, aralar əmələ gəlmək. *Zəlzələdən evin divarları aralandı.* // Qopmaq. *Çəkmənin altı aralanmışdır.*

4. Bir az açılmaq, yarıaçıq hala gəlmək. *Qadınların çarşabları aralandıqda onların nəzmiyyə libası geydikləri görünürdü.* M.S.Ordubadi. *Vahid Nayıbovun ev qapısı həmişəki sakitliyi ilə aralandı və örtüldü.* Mir Cəlal.

5. *məch.* Başqası tərəfindən ayrılmaq. *Puldan bir qədər aralanıb topa ilə əlahiddə qoyulmuşdu.* S.M.Qənizadə.

**ARALAŞDIRILMA** "Aralaşdırılmaq"dan *f.is.*

**ARALAŞDIRILMAQ** *məch.* Bir-birindən ayrılmaq, uzaqlaşdırılmaq, kənara çəkilmək.

**ARALAŞDIRMA** "Aralaşdırmaq"dan *f.is.*

**ARALAŞDIRMAQ** *f.* Dalaşanları bir-birindən ayırmaq, uzaqlaşdırmaq, kənara çəkmək. *Molla aralaşdırır, ona da bir-iki yumruq dəyir.* S.S.Axundov. *Qoca qarılar harayçılıq edib bunları* [dalaşanları] *aralaşdırardılar*. H.Sarabski.

**ARALAŞMA** "Aralaşmaq"dan *f.is.*

**ARALAŞMAQ** *f.* 1. Ayrılmaq, ayrı düşmək, aralı düşmək, uzaqlaşmaq, əlaqəni kəsmək.

2. Seyrəkləşmək.

**ARALATDIRMAQ** *icb.* Üçüncü şəxs vasitəsi ilə aralatmaq. [Xan:] *Mən onun başını bədənindən aralatdıraram, onda bilər ki, nökər bayatı deyib, xanı yuxudan oyatmaz.* Çəmənzəminli.

**ARALATMAQ** *icb.* Aralamağa məcbur etmək.

**ARALI** *zərf* 1. Bir-birindən bir qədər uzaq, arada bir qədər məsafə qoyaraq. *Xasay atlıların bir-birindən aralı getməsini məsləhət gördü.* M.Hüseyn. *Kəhər kövşənin ortasında, yoldan xeyli aralı uçuq bir xarabalığın səmtinə çatırdı.* M.İbrahimov. // Uzaq. *Aralı gəzmək. – Ay ariflər, gəlin sizə söyləyim; İstəkli dostumdan aralı düşdüm.* Aşıq Kərəm. *Lütf elə, Novruzu yetir Qəndaba; Yarı salma məndən aralı, dağlar!* (Qoşma). *Uzaqdasan... görməyirəm... bəlkə də bu an; Qar üstündə sürünürsən bizdən aralı.* S.Vurğun.

2. Bir az açıq, yarıqapalı, yarıörtülü. *Qapını bir az aralı qoy, hava gəlsin. Pəncərə aralı qalmışdı. Sandığın qapağı aralı qalır, örtülmür.*

3. Seyrək. *Ağacları aralı əkmək.*

**ARALIQ** *is.* 1. İki şey arasındakı boşluq, boş yer; iki yerin arası; ortalıq, orta, ara. *Aralıqda qalan şeyləri götürün. Aralıqda gəzib işə mane olma.* // Bir neçə otaq və sairə arasındakı açıq yer. *Samovarı aralıqda qoy. Kömür yeşiyi aralıqdadır.* // *sif.* İki və ya bir neçə şeyin arasında, ortasında olan. *Aralıq malı arada yeyilər. – Əhməd aralıq peçini yandırdı.* Mir Cəlal.

2. Dar dalan, dar küçə. *Dalandar aralığı süpürdü. Bizim ev aralıqdadır. Qapı aralığa çıxır.* // Sif. mənasında. *Fayton aralıq küçələrdən keçib irəliləməyə başladı.* S.Rəhman.

3. "Bu" sözü ilə bərabər: **bu aralıq** – bu zaman, bu vaxt, bu əsnada, bu dəmdə. *Bu aralıq göy guruldamağa başladı. – Bu aralıq quşların civiltiləri hər şeydən əvvəl eşidilir.* M.S.Ordubadi. *Bu aralıq birdənbirə toyuğumu xatırlayıb, cəld hinin ağzına*

*yüyürdüm.* A.Şaiq. // "Bir" sözü ilə bərabər: **bir aralıq** – az zaman, bir müddət, bir anlığa, müvəqqəti olaraq. *Bir aralıq sakitlik düşdü. Bir aralıq səsini kəsdi.*

4. Yerl. halda: **aralıqda** – ortalıqda, ortada, arada. [Heydər bəy:] *Ondan ötrü Səfər bəy məsləhət gördü ki, götürüm qaçım. Toy xərci aralıqda itsin.* M.F.Axundzadə. *..Yarım saat çəkmədi, aralıqda beş-on köynək cırıldı və Hürzad tərəf döyülmüş, söyülmüş, geri çəkilib evdə qapandılar.* Çəmənzəminli. [Səfər bəy:] *Əgər siz başlasanız bir-birinin ziddinə getməyə, aralıqda ziyan çəkən mən olaram.* B.Talıblı.

◊ **Aralıq adamı** – 1) araçı, vasitəçi, aradüzəldən; 2) toyda, məclisdə qonaqlara xidmət edən adam; 3) avara, veyil. **Aralığa almaq** – b a x **araya almaq** (**"ara"**da). *Salmanın bu hərəkətinə ciddi diqqət yetirən cavanlar onu aralığa aldılar.* Ə.Vəliyev. **Aralığa atmaq** – b a x **araya atmaq** (**"ara"**da). **Aralığa gəlmək** – ortaya çıxmaq. *..Evlənmək məsələsinin nə qədər çətin olduğu yenə də aralığa gəldi.* S.S.Axundov. **Aralığa gətirmək** – ortaya gətirmək, meydana atmaq. *Bu inteligentlərin sözün gətirmə heç aralığa.* M.Ə.Sabir. **Aralığa söz qatmaq** – kənar sözlərlə aldatmağa, fikri yayındırmağa çalışmaq. **Aralığa tökmək** – sirrin üstünü açmaq, ifşa etmək, açıb söyləmək. **Aralıq qarışmaq** – b a x **ara qarışmaq** (**"ara"**da). *Aralıq get-gedə qarışırdı. Hər gün şəhərdən gələn bir-birinə zidd xəbərlər kənddə vəziyyəti dəyişirdi.* Mir Cəlal. **Aralıq sözü** – b a x **ara sözü (söhbəti)** (**"ara"**da). **Aralıq vurmaq** – b a x **ara vurmaq** (**"ara"**da). *Baxma firibinə hərzəguların; Aralıq vurmaqdı işi bularən.* Q.Zakir. **Aralıqda qalmaq** – b a x **arada qalmaq** (**"ara"**da).

**ARAM** *is.* [*fars.*] Sakitlik, qərar, rahatlıq, dinclik, sükut; səbir, dözüm. *Hənuz vəsldir, ey mah, yoxdur aramın; Nə növ bəs keçəcək mən fəqirə hicranın?* S.Ə.Şirvani. *Xudayar bəyin bu fikrə düşəndən bir dəqiqə aramı yoxdu.* C.Məmmədquluzadə. [Sara Bəhrama:] *Bir aydır sənsiz aramım yoxdur, dünya başıma dar olubdur.* C.Cabbarlı. □ **Aram etmək (eləmək)** – 1) sakit etmək, rahat etmək. *Axund onu* [Seyidi] *bir növ aram edib evinə təklif etdi.* Ə.Haqverdiyev; 2) sakit olmaq, rahat olmaq, dincəlmək. *Sənsiz, ey can, könlüm aram eyləməz.* Nəsimi. **Aram olmaq** – 1) sakit olmaq, rahat olmaq, qərar tapmaq; 2) səbir etmək. [Molla Qafar:] *Kərbəlayı, bir aram ol. Bu saat məsələni qurtarmaq lazımdır.* S.Rəhimov. **Aram tutmaq (tapmaq)** – sakit olmaq, rahat olmaq, qərar tapmaq, səbir etmək. *Can neçün aram dutsun, həddən ötdü intizar.* Xətayi. [Nuxalılar:] *Ağa, sakit ol. Aram tut. Olacağa çarə yoxdur..* M.F.Axundzadə.

**aram-aram** *zərf* Yavaş-yavaş, asta-asta, aramla. *Aram-aram danışmaq. Aram-aram oxumaq. İşi aram-aram gör. – Tabut gedir... Bu ağrıdan ürəklər də qana dönür; Cənazənin arxasınca aram-aram el sürünür.* B.Vahabzadə.

**aramla** *zərf Qaraca qız qalxıb aramla geyinməyə başladı. Sonra əl-üzünü yuyub, çay içməyə məşğul oldu.* S.S.Axundov. *"Mirzəyi" havasında bir vəzn ağır və aramla vurulur.* Ə.Bədəlbəyli.

**ARAMA** "Aramaq"dan *f.is.*

**ARAMAQ** *f.* Axtarmaq. *Sən mükafatını insanlığa xidmətdə ara; Əbədi zövqü, təsəllini həqiqətdə ara.* A.Səhhət. *Mühəndis yenə də öz dəftərçəsinin neft ilə yağlanmış vərəqlərini aramağa başladı.* B.Talıblı. □ **Arayıb axtarmaq** – maraqlanmaq, soruşub bilmək, xəbər tutmaq. *Yar məgər yarını yadına salmaz; Arayıb axtarmaz, qəminə qalmaz?* Q.Zakir.

**ARAMCA** *zərf* Aramla, aram surətdə, ağır-ağır, yavaş-yavaş, yavaşca. [Bülənd] *aramca atın cilovunu çəkir, at da ehtiyatla rahat addımlayırdı.* Ə.Əbülhəsən.

**ARAMGAH** *is.* [*fars.*] *tənt.* 1. İstirahət yeri, dayanılan yer; məskən, mənzil. *Bu, bəzmixasi-ünsdür, aramgahi qüdsdür.* Nəbati.

2. *məc.* Qəbir mənasında. *Bura hündür, qübbəli divarları və qübbəsi başdan-başa kaşılarla örtülmüş bir otaqdır, bura böyük şairin aramgahıdır.* Ə.Sadıq.

**ARAMLI** *sif.* 1. Səbirli, dözümlü.

2. Ağır, yavaş.

**ARAMSIZ** 1. *sif.* Aramı olmayan, qərar tapmayan, qərarsız, narahat; səbirsiz, dözümsüz. *Həsən tramvay duracağında .. aramsız bir ürək çırpıntısı ilə Dilaranı gözləyirdi.* M.İbrahimov.

2. *zərf* Səbirsizliklə. *Havva qonağı aramsız gözləyirdi.* Mir Cəlal. *Mustafa kişi isə sobaya aramsız odun atırdı.* İ.Şıxlı.

3. *zərf* Arası kəsilmədən, durmadan. *Əhmədin tərəfindən isə göndərilən elçilər və minnətçilər aramsız gəlib-getməkdə idi.* B.Talıblı. *Mən gecələri yatmayıb dərsimi hazırlayır, hisli çırağın işığında aramsız çalışırdım.* M.Hüseyn.

**ARAMSIZLIQ** *is.* Qərarsızlıq, rahatsızlıq; səbirsizlik.

**ARAN** *is.* Azərbaycanda: yaylaq yerlərə nisbətən alçaq və iqlimcə isti olan yerlər. *Azərbaycanın əsas aran yerləri Muğan, Qarabağ, Şirvan və Mil düzləri hesab olunur. Yayda aran çox isti olur. – Əziziyəm bağ ilən; Bağça ilən, bağ ilən; Dedin aranda gözlə; Yolun saldın dağ ilən.* (Bayatı). *Arandan qaçıb gələn köç, yolları və şəhərin ətrafındakı dağ və təpələri doldurmuşdu.* Çəmənzəminli. // Düzənlik (*dağ* müqabili). [Kərim bəy] *təpənin ortasındakı taladan, həm arana seyr etməyə, həm də buradakı rəsədxanaya baxmağa gəlmişdi.* Mir Cəlal. *Fəcrin soyuq tonqalı buludlarda yananda; Mən də tonqal qalardım gah dağda, gah aranda.* Ə.Cəmil.

**ARANÇI** *is. məh. köhn.* 1. Yayda yaylağa köçməyib, öz təsərrüfatında qalıb işləyən kəndli. // Aran yerlərdə yaşayan adam. *– Arançılar damların üstündə, talvarlarda özlərinə yer salmışdılar. Qazma daxmalarda oturmaq mümkün deyildi.* İ.Şıxlı.

2. Keçmişdə arandan dağa (yaylağa) şey daşıyan, mal gətirib satan və oradan ağarantı alıb aparan adam.

**ARANÇILIQ** *is. köhn.* Arançının işi, peşəsi.

**ARANJİMAN** *is. mus.* 1. Bəstələnmə, tərtib etmə.

2. Uyğunlaşdırma.

**ARANLI** *is. dan.* Həmişə aranda yaşayan adam.

**ARANLIQ** *is.* Aran yerlər.

**ARANMA** "Aranmaq"dan *f.is.*

**ARANMAQ** *məch.* Axtarılmaq. *Orda hər şey alın təri və zəhmətdən yaranardı; Yaşamaqçın ən müqəddəs, təmiz yollar aranardı.* M.Dilbazi.

**ARASIKƏSİLMƏZ** *sif.* Arası kəsilməyən, bir an belə dayanmayan, sürəkli, fasiləsiz. *Arasıkəsilməz həmlə. Arasıkəsilməz yağış. – Çöldə çaqqalların ulaşması və cırcıramanın arasıkəsilməz nəğməsindən başqa, heç bir şey çayxananın sükutunu pozmurdu.* M.İbrahimov.

**ARA-SIRA** *zərf* Arabir, bəzən, hərdənbir, bəzi vaxt, bəzi hallarda, vaxtdan-vaxta. *Səhərlərə məxsus olan nəsimdən ara-sıra yarpaqlar qımıldanır.. Yarpaqlar arasına sığınmış quşcuğazlar səs-səsə verib ötüşürdü.* A.Şaiq. *Kənddə həmişəki kimi sakitlik aram idi. Ancaq ara-sıra kəndin kənarında bir-iki köpəyin hürməsi eşidilirdi.* B.Talıblı. *Ara-sıra bu işıq sütunu sanki dairəvi bir şüşəyə rast gələrək sınırdı.* M.İbrahimov.

**ARAŞDIRICI** *is.* Axtarıcı, yoxlayıcı. // Tədqiqatçı. *Araşdırıcı məsələyə sistemli yanaşmalıdır.*

**ARAŞDIRILMA** "Araşdırılmaq"dan *f.is.*

**ARAŞDIRILMAQ** *məch.* Axtarılmaq, yoxlanılmaq. // Tədqiq edilmək.

**ARAŞDIRMA** 1. "Araşdırmaq"dan *f.is.*

2. *is.* Tədqiqat. Elmi araşdırmalar. *Azərbaycan şifahi xalq ədəbiyyatına dair son araşdırmalar.*

**ARAŞDIRMAQ** *f.* Axtarmaq, yoxlamaq. [Xəfiyyələr] *küçədə gedən arvadların bağlamalarını belə açıb araşdırırlar.* M.S.Ordubadi. *Kərim bəy əlini cibinə salıb araşdırdı.* Mir Cəlal. // Tədqiq etmək, təhlil etmək. [Qəhrəman] *uşaqda olan bu aləmi öz fikrində araşdıra-araşdıra* (z.) *yuxuya getdi.* S.Rəhimov.

**ARAŞQIN** b a x **araqçın**. *Araşqını dəstə qoy; Endirib göz üstə qoy; Gətir bütün dərdləri; Dərdimin düz üstə qoy.* (Bayatı).

**ARAŞMAQ** *f. məh.* Axtarmaq, aramaq; soraqlaşmaq, xəbər almaq. *Kimin kim eşq bağlar əl-ayağın, dəxi açılmaz; Bu müşkül mənini çox kimsədən Qövsi araşıbdır.* Qövsi.

**ARAT** *is. k.t.* Şumlanıb sulanmış, toxum səpilmiş yer. // Toxum səpmədən əvvəl

şumun sulanması. *Arat torpağın fiziki xassəsini yaxşılaşdırır. – Arat olunmuş torpaq yaxşı qurumayıb, havalar mane olur.* M.Hüseyn. ☐ **Arat(a) qoymaq, arat eləmək** – toxum səpmədən əvvəl şumu suvarmaq. **Aratı çıxmaq** – müəyyən dərəcədə quruyaraq, toxum səpilmək üçün münasib hala gəlmək (arat olunmuş yer). **Aratı qaçmaq** – çox qurumaq, lazımi dərəcəni keçmək (arat olunmuş şum).

**ARATLAMA** "Aratlamaq"dan *f.is.*

**ARATLAMAQ** *f. məh.* Arata qoymaq (b a x **arat**).

**ARAVURAN**, **ARAVURUŞDURAN** b a x **araqarışdıran**.

**ARAYATI** *zərf məh.* Arada bir gecə yatmaqla (bir günlükdən uzaq olan yol haqqında).

**ARAYICI** *sif.* və *is.* Axtaran, arayan.

**ARAYIŞ** *is.* 1. Arama, axtarma işi.

2. Bir şey haqqında şifahi və ya yazılı məlumat. *Arayış almaq. Arayış vermək. Arayış üçün müraciət etmək. Arayışa möhür vurdurmaq. Arayış kitabçası* (məlumat kitabçası). – [Dəmirov] *telefona yaxınlaşıb arayış bürosu vasitəsilə teatrın telefon nömrəsini öyrəndi.* S. Rəhimov.

**ARÁYİŞ** *is.* [*fars.*] *klas*. Bəzək, zinət. *Olub arayişi-baği-səadət cəhlpərvərlər; Neçin arif yaşar dünyada bədbəxtanə, bilməm ki?* M.Hadi.

**ARAZBARI** *is.* Azərbaycan musiqisində təbiət və insan gözəlliyini vəsf edən lirik xarakterli, gümrah və nikbin təsirli vokal-instrumental pyes. *Aşıq Cəfər və balabançı .. məclisin ortasında dayanırlar və keçirlər arazbarı çalğısına.* Ə.Haqverdiyev.

**ARBÍTR** [*lat.*] b a x **münsif**.

**ARBİTRÁJ** [*fr.*] Münsiflər məhkəməsi; idarələr, müəssisələr, təşkilatlar arasındakı mübahisəni həll edən idarənin adı. ☐ **Beynəlxalq Arbitraj** – dövlətlər arasındakı mübahisəli məsələləri sülh yolu ilə həll etmək üçün beynəlxalq münsiflər məhkəməsi.

**ARÇAN** *sif. bot.* Ardıc (ağac). *Arçan ağacı daşa dönmüş, fəqət torpaq olmamışdır.* S.Vurğun. *Buxarıda alışır; Quru arçan odunu.* R.Rza.

**ARD** *is.* 1. Arxa, dal. *Yükü ardına almaq.* ☐ **Ardına (ardınca) düşmək** – dalınca düşmək, izləmək. *Pul ardına düşmək. Ovçu tülkünün ardına düşdü. İş ardına düşmək.*

2. Bir şeyin arxa, dal tərəfi, gerisi, geri tərəfdə olan yer. *Evin ardı. Dəyirmanın ardı bağçadır. – Günəş çəkilirkən dağlar ardına; Üfüqlər qarardı, sular qarardı.* S.Vurğun.

3. Başlanmış bir şeyin davamı, dalı, mabədi, sonu. *Məqalənin ardı məcmuənin gələn nömrəsində dərc olunacaqdır. Söhbətin ardı sabaha qaldı. Hekayənin ardı uzun olacaq.* ☐ **Ardı kəsilmək** – arası kəsilmək, dalı kəsilmək, qurtarmaq, bitmək. **Ardı (ardı-arası) kəsilməmək** – bitməmək, qurtarmamaq, sonu-axırı görünməmək. *Dağların ardı-arası kəsilmir, zəncir kimi bir-birinə hörülmüş, bir-birini qucaqlamış kimi durur.* A.Şaiq.

◊ **Ardı açılmaq** – 1) paxırı açılmaq, təqsirinin, eybinin üstü açılmaq, ifşa olunmaq; 2) yorulmaq, taqətdən düşmək, üzülmək. **Ardı atmaq** – ayaq yoluna düşmək, qarın ağrısına düşmək, ayağı işləmək. **Ardı burulmaq** – bərk arıqlamaq, zəifləmək, yeriyərkən taqətsizlikdən ayaqları dolaşmaq. **Ardı çıxmaq** – 1) bərk arıqlamaq, zəifləmək, bərk yorulmaq; 2) lap qocalmaq, əldən düşmək, ölümü yaxınlaşmaq.

**ARDIC** *is. bot.* Sərv ağacı fəsiləsindən olub, çox zaman qayalıqlarda bitən iynəyarpaqlı, həmişəyaşıl kol, ya ağac. *Ardıc növləri dekorativdir.*

**ARDICIL** 1. *sif.* Müəyyən bir fikri, məsləki təqib edərək, dönmədən onun ardınca gedən. *Ardıcıl inqilabçılar. Ardıcıl materialistlər. Ardıcıl inqilabi xətt yeritmək.* // İs. mənasında. *Nəiminin ardıcılları.*

2. *zərf* Arası kəsilmədən, bir-birinin ardınca, müntəzəm surətdə. *..Oğlu Tapdığın həyatı ardıcıl surətdə gəlib onun* [Ağcanın] *gözü qabağından keçirdi.* Ə.Əbülhəsən. *Beləliklə, musiqi əsərlərindəki ağır və yüngül səslərin ardıcıl və müntəzəm surətdə təkrar edilməsi musiqinin bərabər ölçülü ayrı-ayrı taktlara* (*xanələrə*) *bölünməsini əmələ gətirir.* Ə.Bədəlbəyli.

3. *sif.* Məntiqli, məntiqə əsaslanan, qanunauyğun. *Ardıcıl mühakimə. Ardıcıl nəticələr çıxarmaq. Ardıcıl materializm nəzəriyyəsi.*

**ARDICILLIQ** *is.* 1. Müəyyən bir fikri, məsləki dönmədən təqib etmə, axıra qədər onun ardınca getmə. *Fikirdə ardıcıllıq.*

2. Bir-birinin ardınca gəlmə, arası kəsilmədən davam etmə. *Hadisələrin ardıcıllığı. – Səhər gimnastikasında fiziki hərəkətlərin ardıcıllığı böyük əhəmiyyətə malikdir.* Zərgərli.

3. Məntiqlilik, məntiqə əsaslılıq, qanunauyğunluq. *Mühakimənin ardıcıllığı. – Ədəbi, nəzəri tənqid ardıcıllıq, prinsipiallıq tələb edir.* S.Rəhimov.

**ARDINCA** *zərf* Dalınca, arxasınca, izincə; izləyərək, təqib edərək. *Ardınca getmək. Bir-birinin ardınca gəlmək. Günlər, həftələr, aylar bir-birinin ardınca gəlib keçir. – Hər qandə şam olursə, ardıncə sübhdəmdir.* Nəsimi. *Xurşidi-mey ardınca səni hər gecə ta sübh; Ey mah, nə layiqdi ki, səyyarə desinlər.* S.Ə.Şirvani. *Əcnəbi müsafir Bakının məşəqqətli ruzgarına adət etmədiyindən tozun qorxusundan gözlərini yumub, Məşədi Əsgərin ardınca ahəstə-ahəstə gedirdi.* S.M.Qənizadə.

**AREÁL** *is.* [*lat.*] Müxtəlif qəbildən olan şeylərin (dil, xalq, heyvan, bitki və s.) yayıldığı ərazi. *Arealın müqayisəli öyrənilməsi.*

**ARÉNA** *is.* [*lat.*] 1. Sirk səhnəsi. *Müasir sirkdə arena manej adlanır.*

2. Fəaliyyət göstərilən yer.

3. *biol.* Orqanizmin mövcud olduğu bütün yerlərin məcmusu. *Həyat arenası.*

**ARƏSTƏ** *sif.* [*fars.*] *köhn.* Bəzənmiş, bəzəkli, düzəlmiş. ◻ **Arəstə olmaq** – bəzəkdüzəyi, yaxud nizam və qaydası hazır olmaq. [Xan:] *..Zalım uşaqlarının kefi kef deyil, bir əlamətdi; məclis arəstə, saqi hərəkətdə..* N.Vəzirov.

**ARƏSTƏLƏŞDİRMƏK** *f. köhn.* Bəzəyərək hazır etmək, düzəldib hazırlamaq.

**ÁRFA** [*alm.*] *mus*. Üzərinə simlər çəkilmiş böyük üçbucaq çərçivə şəkilli barmaqla (mizrabsız) çalınan musiqi aləti; cəng. [İnsanlar] *kamanların altına çanaqlar qayırıb, kirişlərin də sayını artırmaq yolu ilə nəticədə arfa və arfaya bənzər cəng musiqi alətlərini ixtira edirlər.* Ə.Bədəlbəyli.

**ARFAÇALAN**, **ARFAÇI** *is.* Arfa çalan çalğıçı.

**ARĞAC** *is. toxuc.* Xalçada, gəbədə və ümumiyyətlə toxunan şeylərdə eninə gedən ip (*əriş* müqabili). *Arğac sapı sarıyan maşın quruldu. – Xoşqədəm diz üstə oturub, sağ əlinin baş və şəhadət barmağı ilə fərşin köhnəlmiş arğaclarını qurdalaya-qurdalaya davam etdi.* Ə.Vəliyev.

◊ **Arğac keçmək** – birisinin işinə pər vurmaq, zərər vermək, yaxud onun düzəlməsinə mane olmaq üçün xəlvəti söz demək, əlaltından işləmək, qarışdırmaq.

**ARĞACLAMA** "Arğaclamaq"dan *f.is.*

**ARĞACLAMAQ** *f. toxuc.* Xananın arğacını keçirmək.

**ARĞACLANMA** "Arğaclanmaq"dan *f.is.*

**ARĞACLANMAQ** *məch. toxuc.* Xanaya arğac keçirilmək.

**ARĞACLIQ** *is. toxuc.* Arğac üçün yararlı. *Arğaclıq ip.*

**ARĞALI** *is. məh.* Vəhşi qoç.

**ARĞAZ** *sif. məh.* Nə kök, nə arıq. *Bu dərviş ucaboylu, arğaz, uzunsaçlı və saqqallıydı.* A.Divanbəyoğlu. *Bu danışığa qulaq asan hündürboylu arğaz kişi* [Alo ilə Qəmərin] *söhbətinə qarışdı.* S.Rəhimov.

**ARĞIN**: **yorğun-arğın** – b a x **yorğun-arğın**.

**ARX** *is.* Tarlaya, bostana və s.-yə su axıtmaq üçün açılan yol. *Arxlar axır çay olur. – Yolun iki yanı ilə axan balaca arxlar axşamdan donmuşdu.* M.Hüseyn.

◊ **Arxa bir də su gələr** – "ümidini kəsmə" mənasında məsəl. *Sirişki-çeşm töküb ağla yar üçün, Seyyid; Bu arxa su gəlib, ümmid var bir də gələ.* S.Ə.Şirvani.

**ARXA** *is.* 1. İnsanın, heyvanın dalı, kürəyi, beli. *Arxasına yükləmək. Arxasını çevirmək. Arxası üstə yerə gəlmək. – Qız arxası üstə uzanıb kitab oxuyurdu.* N.Nərimanov. *Tutulanların ikisinin arxasında iri şələ vardı.* Ə.Vəliyev. ◻ **Arxa çevirmək** – dal çevirmək, üz döndərmək. **Arxası yerə dəyməmək** – basılmamaq, məğlub olmamaq. **Arxası yerə gəlmək** – basılmaq, məğlub olmaq. **Arxasın(c)a düşmək** – birinin dalınca düşmək, təqib etmək, izləmək. *Mədəd naharını qurtarıb qapıdan çıxdı. Kosa onun arxasına düşdü.* S.Rəhimov. **Arxasını işə verməmək** – heç bir işdən

yapışmamaq, tənbəllik etmək, işdən boyun qaçırmaq. **Arxasını yerə vermək (qoymaq)** – basmaq, məğlub etmək. [Vəzir:] *Mən cavab verdim ki, əgər mənə yaraşsaydı, ..güləşib onun arxasın yerə qoyardım.* M.F.Axundzadə.

2. Bir şeyin dal tərəfi, geri tərəfi. *Məktəbin arxa tərəfi bağdır. – Pinəçi.. dalımca gəlin, – deyib dükanın arxasına keçdi.* M.İbrahimov.

3. Müharibə xəttinin dal tərəfində, gerisində olan yer (*cəbhə* müqabili). *Arxada və cəbhədə. Arxada qalanlar cəbhəyə kömək edirdilər. – Qabaq düşmən idi, arxa isə hər gün davam edən bombalama nəticəsində dağıdılırdı.* Mir Cəlal.

4. *məc.* Kömək, havadar, dayaq, himayəçi. *Koroğlunun qoç arxası; Gəldi, dəlilərim gəldi!* "Koroğlu". *Balamsan sən, nəyimsən? Arxamsan, köməyimsən; Mən sənin əziz anan; Sən mənim diləyimsən.* (Bayatı). [Ata:] *Ay bala, niyə xiffət eləyirsən, özün bilirsən ki biz kasıbıq, qohum-əqrəbamız və möhkəm arxamız yox, bizə qızmı verərlər?* Ə.Haqverdiyev. ☐ **Arxa durmaq** – birinin dalında durmaq, havadarlıq etmək, müdafiə etmək. **Arxa-arxaya vermək** – köməkləşmək, bir-birinə kömək etmək, əlbir çalışmaq. *Yeddi qardaş arxa-arxaya verib düşmənə qarşı dayandılar.* **Arxa vermək** – arxalanmaq, güvənmək, istinad etmək. *Padşahlar ancaq əcnəbilərə arxa verməklə yaşaya bilir.* M.S.Ordubadi.

5. Adətən "yeddi" sözü ilə bərabər *məc.* – nəsil, əcdad. *Yeddi arxa qohum-əqrəba. – Firəngistanın Prudon adlı hükəması deyib: Mən fəxr edirəm ki, mənim yeddi arxa ata-babam rəiyyət olub.* N.Vəzirov. [Həpir:] *Xalqın yeddi arxa yadları ağzını açanda tərif tökür.* Mir Cəlal.

**ARXABAARXA** *zərf* 1. Dal-dala.

2. *məc.* Bütün nəsillik. *Su gəlsə arxa bəsdi; Dolansa çarxa bəsdi; Bir kərə üzün görsəm; Arxabaarxa bəsdi.* (Bayatı).

**ARXAC** *is. məh.* Qoyun, mal yatağı; ilin isti aylarında sürü və naxırların çöldə istirahət etdiyi yer. *Arxac suvat yerindən 0,7-1 kilometr məsafədə seçilir. – Nəbinin qoyun sürüsü arxacın üst tərəfindəki yastanaya toplanmışdı.* "Qaçaq Nəbi". *Mal-qara, qoyun-quzu kənddən bir az aralı ferma ağıllarında və arxaclarında dincəlir.* Ə.Vəliyev.

**ARXACLAMAQ** *f. məh.* Sürünü, qoyunu arxaca yığmaq.

**ARXACLANMAQ** *məch.* Arxaca yığılmaq (sürü).

**ARXADAN** *zərf* Daldan, dal tərəfdən. *Arxadan gəlmək. Arxadan vurmaq. – Topçular alayı gəlir arxadan..* S.Vurğun. *Gəzərkən buludlar hey alay-alay; Arxadan boylanar sarı saçlı ay.* R.Rza.

**ARXADAŞ** *is.* Kömək, köməkçi. [Miss Hannaya] *arxadaş və yoldaş lazımdır.* M.S.Ordubadi. // Yoldaş, dost. *Arxadaşlar! Sevinin, oldu rəva hacətimiz.* M.Ə.Sabir. *Bəzi tutmuş iki əlilə başın; Fikrə dalmış, unutmuş arxadaşın.* A.Səhhət. *Dostum, arxadaşım, yoldaşım, dinlə; Nə sayaq unudaq biz bu ağrını?* S.Rüstəm.

**ARXADAŞLIQ** *is.* Dostluq, yoldaşlıq. *Bir-iki gün mənim arxadaşlığımı qəbul etsəniz, qalınız, yenə də xidmətinizdə bulunaram, – dedim.* M.S.Ordubadi.

**ARXAİ́K** *sif. dilç.* Köhnəlmiş, qədim, köhnə. *Arxaik sözlər.*

**ARXAİ́ZM** *is.* [*yun.*] *dilç.* 1. Köhnəlmiş, yaxud istifadədən çıxmış söz, ifadə, qrammatik forma. *Arxaizmlər xalq dilində indi də işlənir.*

2. Qədim zamanların qalığı.

**ARXALANMA** "Arxalanmaq"dan *f. is.*

**ARXALANMAQ** *f.* Güvənmək, istinad etmək, bel bağlamaq. *Geniş kütlələrin, bizə rəğbət bəsləyən və bizi hiss edən .. kütlələrin istiqbalına arxalana bilərik.* M.S.Ordubadi. *Bu böyük günlərə arxalanaraq; Göstər bu meydanda yeni bir hünər!* S.Vurğun. [Nəriman:] *Bu yaxşıdır, – dedi, – yoldaşın yoldaşa arxalanmağı döyüşdə şərtdir!* Mir Cəlal.

**ARXALI** *sif.* Köməyi, himayəçisi, müdafiəçisi, tərəfdarı, qohum-əqrəbası olan. *Atalar yaxşı deyib ki, "arxalı köpək qurd basar".* S.Rəhimov.

**ARXALIQ** *is. köhn.* Yaxası düyməli, beli büzməli, ya büzməsiz üst paltar. [Tubu:] *Bilmirəm, bu bir arxalıq nə olubdur ki, budur, beş gündür onu tikib qurtara bilmirsən.* Ə.Haqverdiyev. *Kişi arxalıq, çuxanı atıb,*

*kostyum, qalstuk geymişdi, papağı çıxarıb fəs qoymuşdu.* B.Talıblı. [Tahirzadə] *sərin xəzri alnına toxunanda arxalığının yaxasını açıb, dərindən nəfəs aldı*. Mir Cəlal.

**ARXALIQLI** *sif. köhn.* Əynində arxalıq olan, arxalıq geymiş. *Arxalıqlı kişi. – Ağ çuxalı, ağ arxalıqlı, ikiüzlü Buxara dərisindən papaqlı, şişman göbəyi üzərində gümüş kəmərli Mirzə Səfəri hamı tanıyırdı.* Ə.Haqverdiyev. *Sərbaz sazı bağrına basıb yanıqlı oxuyurdu. Ətrafına bir dəstə uzun arxalıqlı sərbaz yığılıb dərdli-dərdli qulaq asırdı.* Çəmənzəminli.

**ARXASINCA** *zərf* Bilavasitə dalınca, ardınca. *Ayı Dursunu görüncə arxasınca düşür. Dursun qaçır, ayı qovur.* A.Şaiq. *Qoşun keçib getdi. Arxasınca da bir sürü uşaq və gözüyaşlı qadınlar toz qopararaq yüyürdü.* Çəmənzəminli. *Uşaqların marağı daha da artdı və onun* [Əsədin] *arxasınca gedib, yavaşca qapının çatlağından baxmağa başladılar.* B.Talıblı.

**ARXASIZ** *sif.* Köməyi, arxası, havadarı, himayəçisi olmayan; köməksiz. *Arxalıya arxa olma – yamaq sayarlar; Arxasıza arxa ol – dayaq sayarlar.* (Ata. sözü). *Zöhhakı məhv edən Gavə yoxsul, arxasız bir dəmirçi idi*. H.Cavid. *Bu gün Hüseyn artıq arxasız və kimsəsiz bir yetimdir.* S.Rəhman.

**ARXASIZLIQ** *is*. Arxasız adamın vəziyyəti.

**ARXAYIN** *zərf* 1. Xatircəm, rahat, sakit, dinc, qayğısız. *Arxayın oturmaq. Arxayın oturub işləmək*. *Arxayın gedə bilərsən.* – ☐ **Arxayın olmaq** – xatircəm olmaq, əmin olmaq, nigarançılıqdan qurtarmaq. *Mahmud arxayın ola biləcəyini yəqin etdi.* Ə.Əbülhəsən. **Arxayın etmək (salmaq)** – xatircəm etmək, əmin etmək, nigarançılıqdan qurtarmaq, qəlbən rahat etmək. *Vaqif Kazımın ehtiyatkarlığına heyrət edərək, ürəkdən güldü, sonra onu arxayın edib yola saldı.* Çəmənzəminli. *Ayna. Ayazı bir daha arxayın etdi.* Ə.Məmmədxanlı.

2. Asudə, rahat. *Bu gün işim yoxdur, arxayınam.*

3. Bir şeyə tamamilə inanmış, əmin olmuş, şübhə etməyən, əmin. *Mən bunun belə olacağına tamamilə arxayın idim. İşin öhdəsindən gələ biləcəyinə arxayın deyiləm.*

**ARXAYINCA** b a x **arxayın** 1 və 2-ci mənalarda. *Otuz-qırx addımlıqda iki atlı arxayınca söhbət edərək gəlirdi.* Çəmənzəminli.

**ARXAYINÇILIQ** *is*. *dan.* 1. İşlərin yaxşı gedəcəyinə əsassız olaraq inanmaq nəticəsində hasilə gələn xatircəmlik, əminlik. *Arxayınçılığa tezliklə son qoyulmalıdır.* – [Yolçular] *öz xorultuları ilə çayçının ürəyindəki arxayınçılığı daha da möhkəmləndirdilər*. M.İbrahimov.

2. B a x **arxayınlıq**.

**ARXAYINLAMA** "Arxayınlamaq"dan *f.is.*

**ARXAYINLAMAQ** b a x **arxayınlaşmaq**.

**ARXAYINLAŞDIRMA** "Arxayınlaşdırmaq"dan *f.is.*

**ARXAYINLAŞDIRMAQ** b a x **arxayınlatmaq**. *Bizi arxayınlaşdırmasınlar.*

**ARXAYINLAŞMA** "Arxayınlaşmaq"dan *f.is.*

**ARXAYINLAŞMAQ** *f.* 1. Əldə edilən müvəffəqiyyətlərdən sonra rahat olmaq, daha fəaliyyət göstərməmək. *Əldə edilmiş müvəffəqiyyətlərlə arxayınlaşmaq olmaz. Arxayınlaşmaq üçün heç bir əsas yoxdur.*

2. Arxayın olmaq, xatircəm olmaq, əmin olmaq. [Rayon işçiləri] *öz qəzet və məcmuə paylarını almaq və arxayınlaşmaq istəyirdilər.* S.Rəhimov. *Məmməd arxayınlaşmaq üçün qapıda durub onun dalınca baxdı.* M.İbrahimov.

3. İşdən azad olmaq, işini görüb qurtararaq asudə olmaq. *İşimi qurtardım, arxayınlaşdım.*

**ARXAYINLATMAQ** *f.* Arxayın etmək, arxayın salmaq, xatircəm etmək, əmin etmək, rahat etmək.

**ARXAYINLIQ** *is.* Sakitlik, dinclik, salamatlıq, xatircəmlik, əmin-amanlıq, rahatlıq, asudəlik. *Lakin arxayınlıq şəraitində nə qədər alışıb ehtiyat qazanmış olsa belə, ən xırda şey .. əsgəri narahat edir*. Ə.Əbülhəsən. ☐ **Arxayınlığa çıxmaq** – rahat olmaq, nigarançılıqdan qurtarmaq, rahat həyata başlamaq. *İndi əməlli-başlı arxayınlığa çıxıbdır.*

**ARXAYINLIQLA** *zərf* Arxayın bir halda, rahat bir halda, tələsmədən. *Əyyub yorğun halda işdən qayıdaraq əl-üzünü yuyur, soyunur və arxayınlıqla krovata uzananda Pakizə xalanın çiçəyi çatlayır.* Mir Cəlal.

**ARXEÓQRAF** [*yun.*] Arxeoqrafiya mütəxəssisi, arxeoqrafiya ilə məşğul olan adam.

**ARXEOQRÁFİYA** [*yun.*] *filol.* Qədim yazı abidələrini toplamaq, tədqiq, şərh və nəşr etməklə məşğul olan elm sahəsi. *Arxeoqrafiya sahəsində ilk işlər.*

**ARXEOLÓGİYA** [*yun.*] Qazıntı yolu ilə tapılan maddi mədəniyyət abidələrinə əsasən qədim xalqların yaşayış və mədəniyyətini tədqiq edən elm. *Azıx mağarasının tədqiqi Azərbaycan arxeologiyasının mühüm hadisələrindəndir.*

**ARXEOLOJÍ** *sif.* Arxeologiyaya aid olan. *Arxeoloji qazıntı. Arxeoloji tədqiqat. Arxeoloji ekspedisiya. Arxeoloji tapıntılar. – Şagirdlər* [Teymurdan] *arxeoloji qazıntılar .. haqqında çox maraqlı və yeni şeylər eşidərdilər.* Ə.Sadıq.

**ARXEÓLOQ** [*yun.*] Arxeologiya mütəxəssisi, arxeologiya ilə məşğul olan adam.

**ARXİPELÁQ** [*ital.*] Bir-birinə yaxın adalar qrupu. *Abşeron arxipelaqı. Bakı arxipelaqı.*

**ARXİTÉKTOR** [*yun.*] b a x **memar.**

**ARXİTEKTÚRA** [*yun.*] 1. B a x **memarlıq**.

2. Hər hansı bir binanın üslubu, bədii xüsusiyyətləri. *Azərbaycan arxitekturası.*

**ARXÍV** [*lat.*] 1. Qədim sənədlərin və yazılı abidələrin saxlandığı müəssisə. *Arxiv sənədləri. Arxiv binası. Arxiv idarəsi.* // Bir idarənin köhnə kağızları, kitabları, sənədləri saxlanılan şöbəsi. ☐ **Arxivə vermək** – 1) işə xitam vermək; 2) *məc.* unutmaq, köhnəlmiş hesab etmək.

2. Bir idarə və ya şəxsin fəaliyyətinə aid olan yazılar (məktublar, kağızlar, əlyazmaları və s.). *Cəlil Məmmədquluzadənin arxivi.*

**ARXİVÇİ** *is.* 1. Arxivdə işləyən, arxivə baxan işçi. *Cəfər əmi 1901-ci ildən qəza naçalniki divanxanasının arxivçisi olub*(*dur*). H.Nəzərli.

2. Arxiv işi mütəxəssisi, arxivdə elmi iş aparan mütəxəssis.

**ARXİVŞÜNAS** *is.* [*lat.* arxiv və *fars.* ...şünas] Arxiv işləri mütəxəssisi.

**ARXİVŞÜNASLIQ** *is.* Arxiv işinin metodologiya və üsullarını tədqiq etməklə məşğul olan elm.

**ARXİYEPİSKÓP** [*yun.*] *din*. Baş yepiskop (keşiş).

**ARXQAZAN** *sif.* Arx qazmaq üçün olan. *Arxqazan maşın.*

**ARXLAMA** “Arxlamaq”dan *f.is.*

**ARXLAMAQ** *f. k.t.* Şitil və s. əkmək üçün kiçik arxlar, dayaz çuxurlar qazmaq. *Aprelin axırına kimi qızlar sahələri arxlayaraq bütün şitilləri basdırdılar.*

**ARI**[1] *is.* 1. Zərqanadlılar fəsiləsindən olub bal hasil edən cücü. *Arı beçəsi* (cavan arı). *Arı pətəyi, səbəti, təknəsi* (arıları saxlamaq üçün xüsusi qutu). *Arı şanı* (arıların təknədə mumdan hördükləri göz-göz yuvacıqlar). *Arı vızıltısı. Bal arısı.*

2. Bəzən bütün arı pətəyi, arı dəstəsi mənasında işlənir; pətəkxana. *Yayda arıları yaylağa köçürürlər. Arı qəhrin çəkməyən balın qədrini bilməz.* (Ata. sözü).

◊ **Arı yuvası** – çox qələbəlik haqqında. **Arı yuvasına çöp soxmaq** – birisini hirsləndirmək, acıqlandırmaq; hiddətə, narazılığa, etiraza səbəb olmaq.

**ARI**[2] *sif. köhn.* Təmiz, saf, xalis, duru, parlaq, pak. *Qazan bəg .. arı sudan abdəst aldı.* “Dədə Qorqud”. *Aydan arı, sudan duru.* (Məsəl).

**ARIÇI** *is.* Arı saxlayan, arıçılıqla məşğul olan adam. *Qəhrəman arıçının əməyini təqdir edir, balaca Sabirə arıların yaşayış qaydalarından nağıl edirdi.* S.Rəhimov.

**ARIÇILIQ** *is.* Bal hasil etmək üçün arı saxlama, arı yetişdirmə. *Arıçılıqla məşğul olmaq. Arıçılıq kənd təsərrüfatının çox gəlirli sahələrindən biridir. Arıçılıq hələ eramızdan əvvəl məlum idi.*

**ARIDILMA** “Arıdılmaq”dan *f.is.*

**ARIDILMAQ** *məch.* Təmizlənmək, yaxşısı pisindən, irisi xırdasından ayrılmaq, dənlənmək. *Hərə bir iş görürdü; bir yanda xəmir yoğrulur, bir yanda yumurta çalınır, ..bu biri tərəfdə sabah xörəyi üçün düyü arıdılırdı.* T.Ş.Simurq.

**ARIXANA** *is.* Arı pətəkləri yerləşən yer, arıçılıq təsərrüfatı. *Arıxanada arı pətəkləri şahmat üsulu ilə düzülür. – Qəhrəman balaca Sabiri arıxanadan uzaqlaşdırırdı.* S.Rəhimov.

**ARIQ** *sif.* Cılız, sısqa, zəif, cansız, ətsiz-yağsız (*kök* ziddi). *Arıq adam. Arıq quzu. – Uzunboylu, arıq sifətli, açıq, mavi gözləri*

*ilə sakit-sakit baxan bu qoca usta, tövrünü pozmadan, yavaş-yavaş yerindən qalxdı.* M.Hüseyn.

**ARIQCA** *sif.* Çox arıq. *Arıqca bir uşaq.* // Bir qədər arıq, arıqtəhər. *İdarə başçısı orta yaşlı, qarayağız, arıqca bir adam idi.* Mir Cəlal.

**ARIQLAMA** "Arıqlamaq"dan *f.is.*

**ARIQLAMAQ** *f.* Zəifləmək, ətini tökmək, cansızlaşmaq. *Xəstəlikdən sonra arıqlamaq. İstidən arıqlamaq.*

**ARIQLAŞMA** "Arıqlaşmaq"dan *f.is.*

**ARIQLAŞMAQ** *f.* Yavaş-yavaş, getdikcə arıqlamaq, sısqalaşmaq, zəifləşmək, cansızlaşmaq, əti-yağı tökülmək.

**ARIQLATMA** "Arıqlatmaq"dan *f.is.*

**ARIQLATMAQ** *f.* Birinin arıqlamasına, cansızlaşmasına, ətini tökməsinə səbəb olmaq. *İsti məni arıqlatdı. Atı çox sürməkdən arıqlatmaq.*

**ARIQLIQ** *is.* Arıq adamın, ya heyvanın halı; sısqalıq, cılızlıq, zəiflik, ətsizlik, cansızlıq (*köklük* ziddi). *Uşağın arıqlığı. Atın arıqlığına baxma, çox güclüdür.*

**ARIQ-URUQ** b a x **arıq**.

**ARIQUŞU** *is. zool.* Yaşımtıl rəngli, sərçədən bir az böyük meşə quşu.

**ARINMAQ** *f.* 1. B a x **arıdılmaq**.

2. *qəd.* Yuyunmaq, təmizlənmək, saflanmaq.

**ARINMIŞ** *f.sif.* Arıdılmış, təmizlənmiş. [Sənəm xala] *sol əli ilə arınmış çiyid kisəsinə söykənərək, mənə tərəf əyilir.* Mir Cəlal.

**ARIOT(U)** *is.* İriyarpaqlı, ətirli ot (alaq otu). *Arıotu, limonotu və ya bədrəng .. Azərbaycanın meşəli yerlərində bitir. Tərkibində limon iyi verən yağ vardır.* Qasımov.

**ARITDIRMA** "Arıtdırmaq"dan *f.is.*

**ARITDIRMAQ** *icb.* Təmizlətmək, saf-çürüyünü ayırtmaq.

**ARITLAMA** "Arıtlamaq"dan *f.is.*

**ARITLAMAQ** *f.* Təmizləmək, yaxşısını pisindən, irisini xırdasından ayırmaq; dənləmək. *Buğda arıtlamaq. Düyü arıtlamaq.* – [Tubu:] *Bir az düyü arıtla, atana bir dövrə sulu yayma bişir.* Ə.Haqverdiyev. *Arvad baxıb-baxıb ayağa durdu, düyü çıxarıb arıtladı..* S.Rəhimov.

◊ **Döşünü (sinəsini, boğazını) arıtlamaq** – b a x **boğazını arıtlamaq** (**"boğaz"**da). *Gəldiyev təkrar sinəsini arıtladı.* Mir Cəlal.

**ARITLANMA** "Arıtlanmaq"dan *f.is.*

**ARITLANMAQ** *məch.* Təmizlənmək, yaxşısı pisindən, irisi xırdasından ayrılmaq, dənlənmək.

**ARITMAQ** *f.* 1. *köhn.* Yumaq, yuyub təmizləmək. // Təmizləmək, saflaşdırmaq. *Bu arxı kim arıdıb; Su belə duru gəlir?* Sarı Aşıq.

2. B a x **arıtlamaq**.

**ARİ́** *əd.* [*fars.*] *məh.* Bəli, hə, həri. *Dedi: – Ari, o iki mərdi-dilir; Yuxumu yaxşı etdilər təbir.* S.Ə.Şirvani.

**ÁRİ** *sif.* [*ər.*] *köhn.* Çılpaq, boş; məhrum. *Mürüvvətdən xali, insafdan ari; Yaradıbdır neçün bunları tari.* M.F.Axundzadə. *O soyuqlar ki, ruzi-fitrətdən; Ari idi bütün nəzafətdən.* M.Ə.Sabir. *Səfillər kimi əşcar oldu ari.* M.Hadi. *Hər vəsilə ilə tələş edirlər ki, onu* [mömini] *axirət evinə hər bir günahdan ari və üzü ağ göndərsinlər.* C.Məmmədquluzadə.

**ARİF** *sif.* [*ər.*] Bilən, qanan, başa düşən, anlaqlı, mərifətli. *Arif adam. – Dünyada bir şey var ki, hər bir arif adam ondan gərək xəbərdar olsun.* C.Məmmədquluzadə. *Üstü unlu olan hər arif qoca; Öz ürək sözünü deyər doyunca.* S.Vurğun. // İs. mənasında. *Harda olsa, dövləti-didarın olsun cilvəgər; Arifə məqsəd nə məscid, nə kəlisadır qərəz.* S.Ə.Şirvani. *Arif çalışır ki, millət azad olsun; Zahid çığırır ki, məscid abad olsun.* M.Ə.Sabir. *Ey ariflər, nəzər salın təbiətin qurğusuna!* S.Vurğun. // Xəbərdar, yaxşı tanış, aşna, vaqif. *Yüzbaşı da ki, məsələsinə arifdi.* Ə.Haqverdiyev.

**ARİFANƏ** *zərf* və *sif.* [*ər.* arif və *fars.* ...anə] Arifcəsinə, arif kimi, arif adama, qanacaqlı və mərifətli adama yaraşan bir surətdə. *Arifanə danışmaq. Arifanə məsləhət. – Verdikcə cahaniyanə nəzhət; Yad et məni arifanə yad et.* A.Səhhət. *Görəndə aşiqi min naz ilə işarə edir; Ümumi cəzb eləyən arifanə gözləri var.* Ə.Vahid.

**ARİFCƏSİNƏ** b a x **arifanə**.

**ARİFLƏŞMƏK** *f.* Arif olmaq, kamallı olmaq, mərifətli olmaq, ağıllılaşmaq.

**ARİFLİK** *is.* Anlaqlılıq, mərifətlilik, vaqiflik; anlama, bilmə.

**ARİFMÓMETR** [*yun.*] Mexaniki surətdə hesab əməliyyatı icra edən hesablayıcı maşın.

**ARİLƏR** *cəm* [əsli *sanskr.*] 1. Elmi ədəbiyyatlarda: xalqların Hind və İran qrupuna verilən ümumi ad; ari irqinə mənsub qövmlər. İranın müasir adı "Arilər ölkəsi" deməkdir.

2. Daha geniş və qeyri-elmi mənada Hind-Avropa dillərində danışan xalqlar.

**ARİÓZO** [*ital.*] *mus.* Həcmi etibarı ilə ariyadan kiçik, musiqi quruluşu cəhətdən nisbətən sərbəst tərzdə bəstələnmiş musiqi əsəri. *F.Əmirovun "Sevil" operasında Gülüşün ariozosu. – Lakin məhz operaya xas olan ayrı-ayrı formalara daha çox müraciət edilir; ariya, ariozo, kavatina.. və i.a.* Ə.Bədəlbəyli.

**ARİSTOKRÁT** [*yun.*] Əsilzadə, kübar; aristokratiya zümrəsinə mənsub adam. *Vaqiə aristokrat həyatından götürülmüş bir əyyaşın əhvali-ruhiyyəsini kəskin boyalarla təsvir edirdi.* A.Şaiq. [Firidun] *küçələri dolduran səliqə ilə geyinmiş aristokratlara, tacirlərə, .. əl açan dilənçilərə, yoxsullara baxar və düşünərdi.* M.İbrahimov.

**ARİSTOKRATİYA** [*yun.*] 1. Hakim sinfin yüksək təbəqəsi; zadəganlar, əyanlar.

2. *tar.* Əyanlar hakimiyyəti forması – qədim Yunanıstanda zadəganların dövlət hakimiyyəti formalarından biri. *Aristokratiya anlayışının meydana gəlməsi Platon və Aristotellə bağlıdır.*

3. *məc.* Hər hansı bir sinif və ya ictimai qrupun imtiyazlı yuxarı təbəqəsi.

**ARİSTOKRATLIQ** *is.* Kübarlıq, zadəganlıq, əsilzadəlik.

**ARİTMÍYA** [*yun.*] *tib.* Ürək fəaliyyətinin normal ritminin pozulması. *Bəzi aritmiyalar qan dövranının pozulmasına, başgicəllənməyə səbəb olur.*

**ÁRİYA** [*ital.*] *mus.* 1. Opera, kantata və ya oratoriya əsərlərinin, orkestrin müşayiəti ilə bir müğənni tərəfindən ifa edilən parçası. *Klassik ariya nümunələri.*

2. Melodik cəhətdən xoş insan avazını andıran instrumental pyes.

**ARİYƏT** *is.* [*ər.*] *köhn.* Burovuz şey, müvəqqəti olaraq alınmış şey.

**ARİYƏTƏN** *zərf* [*ər.*] *köhn.* Müvəqqəti olaraq. *Mövlana ərz eylədi ki: – Amma gərək xəlqdən bir kimsənə bu tədbiri bilməyə və zənn etməyə ki, qibleyi-aləm ariyətən təxtü tacdan əl çəkir.* M.F.Axundzadə.

**ARİZ** [*ər.*] *köhn.* 1. Zühur edən, ortaya çıxan, baş verən. *Arizi-qəmlər əlindən ürəgim şişmiş idi; Zənn edirdim edəcəkdir ona çarə cigərim.* M.Ə.Sabir. ☐ **Ariz olmaq** – 1) ortaya çıxmaq, qarşıya çıxmaq, baş vermək. *İndi burada bir sual ariz ola bilər.* C.Məmmədquluzadə. *Nə Səlimədə dul qalmış qadınlara məxsus yas, nə də Yəməndə yetim və himayəsiz qalmış çocuqlara ariz olan məlal yox idi.* H.Nəzərli; 2) demək, xahiş etmək, ərz etmək. *Şeyləri dallarına yükləyən hamballar gəlib bizə ariz oldular ki, biz düşək qabağa və bunlara yol göstərək.* C.Məmmədquluzadə.

2. Ərizəçi, şikayətçi. *Müşküldür arizə divandan mədəd.* Q.Zakir. *Hərə öz tələbatını ortalığa qoyub, hökumətə ariz olmuşdu.* C.Məmmədquluzadə.

3. *klas.* Yanaq, üz (çox zaman tərkibdə işlənir). *Can cilvələnir qaməti-mövzunu görəndə; Dil tazələnir arizi-dilcunu görəndə.* Q.Zakir. *Elə bil qövsi-qüzəhdir çəkilib çərx üzrə; Gör nə rəngin yaraşır arizi-gülnarə bu xətt.* Nəbati. *Qanadın altına qoyma başını; Tökmə gül arizinə göz yaşını.* A.Səhhət. *Meydənmi qızarmış onun arizi-ali; Ziynət verən ol baği-baharə nə dedin bəs?* Ə.Vahid.

**ARİZƏ** *is.* [*ər.*] *köhn.* 1. Maneə, çətinlik, əngəl. // Hadisə, qəza.

2. Ariz olan hal, sonradan əmələ gəlmiş hal, nöqsan və s.

**ARİZƏLİ** *sif. köhn.* Maneəli, əngəlli, keçilməsi çətin olan. *Bu mövqe..* [düşmənin] *müşahidə və atəş sahəsindən kənarda arizəli, qalın ağaclıq bir yer idi.* Ə.Əbülhəsən.

**ARKTİK** *sif. coğr.* Arktikaya aid olan; şimali, qütbi. *Arktik uçuş. Arktik iqlim. Arktik soyuqlar. Arktik ekspedisiya.*

**ÁRKTİKA** [*yun.*] *coğr.* Yer kürəsinin şimal qütb sahəsi. *Sakit okeanın isti sularının Arktikaya təsiri nisbətən zəifdir.*

**ARQÓ** [*fr.*] *dilç.* Yalnız bir məhdud və peşəkar qrupun və s.-nin işlətdiyi və başqa-

larının başa düşmədiyi şərti ifadə və sözlər. *Arqo xalq danışıq dili və jarqondan fərqlənir.*

**ARQOTÍZM** [*fr.*] *dilç.* Ədəbi dilə hər hansı bir arqodan keçmiş söz və ya ifadə (b a x **arqo**).

**ARLANMA** "Arlanmaq"dan *f.is.* *Arsız nədən arlanar?!* (Məsəl).

**ARLANMAQ** *f.* Utanmaq, həya etmək, xəcalət çəkmək.

**ARLI** *sif.* Həyalı, utancaq.

**ARLI-ABIRLI** b a x **arlı**.

**ARMAĞAN** *is.* Hədiyyə, bəxşiş, pay, sovqat, töhfə. *Əzəl başdan Bəsrə, Bağdad eliniz; Bəylər üçün armağandır teliniz.* M.V.Vidadi. *Qoydu əzizləyib isti qoynuna; Eşqin armağanı ad verək buna.* M.Rahim. *Şerimlə cəbhəyə gedəcək canım; Ucuz tutulmasın bu armağanım.* O.Sarıvəlli.

**ARMATÚR** [*lat.*] 1. Hər hansı bir aparat, maşın, qurğu və s. üçün lazım olan mexanizmlərin və alətlərin məcmusu. *Buxar qazanının armaturu. Qoruyucu armatur.*

2. Elektrik işığı çəkmək və s. üçün lazım olan avadanlığın hamısı.

3. İnşaatda işlədilən metal ləvazimat (dəmir bəndlər, sürgü, cəftə və s.). // Dəmir-beton konstruksiyalarda betonu gücləndirmək üçün işlədilən polad mil, metal tor, karkas, şveller və s.-dən ibarətdir. *Blokların dənizdə möhkəm oturması üçün onların ayaqlarının içindən dəniz dibində quyular qazılır və oraya armatur buraxılaraq sementlənir.* Quliyev.

**ARMATURÇU** *is. xüs.* Armatur qayıran, quran və ya armatura xidmət edən fəhlə.

**ARMUD** *is.* Alt tərəfi yumru, saplaq tərəfi isə getdikcə incələşən şirin meyvə və bu meyvənin ağacı. *Armud ağacı. Armud mürəbbəsi. Armudun yaxşısını meşədə ayı yeyər.* (Ata. sözü).

**ARMUDBOĞAZ** *sif.* Boğazı uzun və arıq. [Mirab:] *Ağalığın yeri qovrulacaq, armudboğaz Qədim suya sirab olacaq!* S.Rəhimov.

**ARMUDGÜLÜ** *is. bot.* Çoxillik bir ot.

**ARMUDLUQ** *is.* Armud bağı, armud ağacları əkilmiş yer. *Armudluğa gedərkən birdən qara köpək cəvərəni yerə atıb, ildırım kimi götürüldü.* S.S.Axundov.

**ARMUDU** *sif.* Armuda oxşar, armud şəklində. *Armudu stəkan. Armudu çiçək. – Məşuqə güllü armudu stəkana xeyli baxdı, onu saxsı cürdəkdən su ilə doldurdu və eyvana çıxıb pilləkən aşağı həyətə düşdü.* S.Rəhimov. *Kasıb evlərdə isə .. fincanlar əvəzinə adi xırda armudu stəkan qoyardılar.* H.Sarabski.

**ARNAÚD** b a x **alban** 1-ci mənada.

**ARO(Y)** *is. məh.* Paltar yuyulduqdan sonra qalan kirli su; çirkab.

**ARPA** *is.* 1. Adətən, yazlıq taxıl bitkisi. *Arpa əkini. Ağ arpa. Arpa vələmirdən daha qidalıdır və daha yaxşı həzm olunur. – Arpanı sütül, buğdanı ötür.* (Məsəl). *Arpa verilməyən at qamçı gücünə yeriməz.* (Ata. sözü).

2. Qızıldan, ya gümüşdən qayrılan, formaca arpa dəninə bənzəyən, lakin həcmcə ondan böyük olan zərgərlik məmulatı.

◊ **Arpaya düşmək** – həddən artıq arpa yeməkdən xəstələnmək (at haqqında). **Arpası artıq (çox) düşmək** *məc.* – qudurmaq, həddini aşmaq, harınlaşmaq. [Kürd Musa:] *Ay Eldar! Doğrudan da bəylər ki var; Bir azca arpası çox düşən zaman; Yabı cinsi kimi şıllaq atırlar.* S.Vurğun.

**ARPACIQ** *is.* Nişan almaq üçün tüfəng, tapança və pulemyot lüləsinin uc tərəfindəki çıxıntı, qabarcıq, buruncuq. *Tüfəngin arpacığı.* – [Lidiya] *avtomatla güllə səpələyə-səpələyə irəliləyir, getdikcə arpacığın qabağını tuturdu.* Ə.Əbülhəsən.

**ARPALAMA** "Arpalamaq"dan *f.is.*

**ARPALAMAQ** *f.* Heyvana arpa vermək. *Axşamüstü Niyaz tövləyə girir, atların çulunu açır, tumarlayır, yenə də suya aparıb gətirir, arpalayırdı.* Ə.Vəliyev.

**ARPALANMA** "Arpalanmaq"dan *f.is.*

**ARPALANMAQ** *məch.* Arpa verilmək, arpa ilə yemlənmək.

**ARPALI** *sif. köhn.* Arpası olan (b a x **arpa** 2-ci mənada). *Arpalı boyunbağı. Arpalı başlıq.*

**ARPALIQ** 1. *sif.* Arpaya aid və mənsub olan.

2. *is.* Atların azı dişlərindəki çökəklik, çuxur.

**ARPA-SAMAN** *is.* Arpa və samandan ibarət heyvan (at, eşşək) yemi. [Tükəzban təlimatçıya:] *Bir yaxşı donluq da vermirsiniz*

*ki, ata verdiyim arpa-samanın pulu çıxsın, barı..* B.Talıblı.

**ARPASUYU** *is. dan.* Pivə.

**ARSÉN** [*lat.*] *kim.* Asan əzilən, kövrək, boz, ya sarı rəngli qeyri-metal; kimyəvi element. *Arsenin bütün birləşmələri çox zəhərli maddələrdir.*

**ARSENİTLƏR** *cəm* (*kim.*). Arsenit turşusu duzları.

**ARSIZ** *sif.* Arı, həyası olmayan; həyasız, utanmaz, sırtıq, üzlü. *Arsız adam. – Arsıza bir sillə kar eləməz.* (Məsəl). *Arsız aşıq elsiz niyə yaşadı; Ölsün Ələsgərtək qulların, dağlar!* Aşıq Ələsgər. *Bizi ən çox heyrətə salan Səttarxanın evinin dağılmasına tamaşa üçün toplanan arsızların* (is.) *söhbəti idi.* M.S.Ordubadi.

**arsız-arsız** b a x **arsızca(sına).** *Arsız-arsız danışmaq. Arsız-arsız gülmək.* – [Səlim:] *Hələ arsız-arsız fit də çalırsan.* C.Cabbarlı. *Əli bayaq Hüseynin qırdığı ipi əlində oynadaraq, arsız-arsız hırıldayır.* S.Rəhman.

**ARSIZ-ABIRSIZ** b a x **arsız**.

**ARSIZCA(SINA)** *zərf* və *sif.* Həyasızcasına, utanmazcasına. *Arsızcasına danışmaq. Arsızcasına hərəkət.*

**ARSIZLA(N)MAQ** *f.* Həyasızlaşmaq, abırsızlaşmaq, izzəti-nəfsini itirmək.

**ARSIZLAŞMA** "Arsızlaşmaq"dan *f.is.*

**ARSIZLAŞMAQ** *f.* Daha da həyasızlaşmaq, arsız olmaq; sırtıqlaşmaq, izzəti-nəfsini itirmək.

**ARSIZLIQ** *is.* Həyasızlıq, utanmazlıq, sırtıqlıq, abırsızlıq. *Yaxınlaşan faytonçu isə hər şeyi arsızlıqla yola verməyə çalışır, bəzən ağlamsınır, lakin yenə də cəsarətlənib banditləri lağa qoyurdu.* M.Hüseyn. □ **Arsızlığa qurşanmaq, özünü arsızlığa qoymaq** – heç şeydən (kəsdən) utanmamaq, çəkinməmək, ədəb dairəsindən çıxmaq.

**ARSLAN** b a x **aslan**. □ **Arslan ürəkli** – cəsur, igid, heç şeydən qorxmayan.

**ARŞ** *nida.* Yerimək, hərəkət etmək üçün komanda əmri. *Arş, irəli! Arş, unut qəmləri! Qaçma bəlalar qabağından geri.* A.Səhhət.

**ARŞIN** *is.* Metrik ölçü sistemi qəbul olunanadək işlədilən uzunluq ölçüsü (0,71 metrə bərabərdir). [Əsgər bəy:] *Təbrizdə arşını bir abbasıya alınan çit burada altı şahıya satılır.* M.F.Axundzadə. *Mağaza sahibi iki arşın ölçüb kəsdi, sonra kağıza qoyub Bahadıra verdi.* N.Nərimanov. // Bu uzunluqda olan ölçü aləti.

◊ **Elə bil arşın udub** – qeyri-təbii şəkildə özünü şax tutan adam haqqında. **Öz arşını ilə ölçmək** – bir şeyi öz şəxsi nöqteyi-nəzərindən, birtərəfli qiymətləndirmək. [Dilşad:] *Sən hamını öz arşınınla ölçmə.* İ.Əfəndiyev.

**ARŞINÇI** b a x **arşınmalçı**.

**ARŞINLAMA** "Arşınlamaq"dan *f.is.*

**ARŞINLAMAQ** *f. köhn.* 1. Arşın ilə ölçmək. 2. *məc. dan.* Veyllənmək, dolaşmaq, boş-boşuna gəzmək. [Qadir:] *Əlin şalvar cibində küçələri arşınlayırsan.* Ə.Əbülhəsən.

**ARŞINLANMAQ** *məch.* Arşın ilə ölçülmək.

**ARŞINLIQ** *sif.* Bir arşın uzunluğunda, enində, ya dərinliyində olan. *Arşınlıq quyu.* // Rəqəmlərlə. [Veys:] *Çiynimdə mən dörd arşınlıq girdini .. meşədən gətirəndə belə yorulmazdım.* Ə.Əbülhəsən.

**ARŞINMALÇI** *is. köhn.* Dalında boğçada arşınmalı gəzdirib satan adam. [Qızlar xoru:] *Arşınmalçı, mal göstər; Bir-bir yerə sal göstər.* Ü.Hacıbəyov.

**ARŞINMALÇILIQ** *is.* Arşınmalı satma işi, bəzzazlıq. [Gülçöhrə:] *Amma, məncə, arşınmalçılıq pis iş deyil ki, o da tacir kimi bir şeydir.* Ü.Hacıbəyov.

**ARŞINMALI** *is.* Toxunma mallar: çit, mahud, bez və s.; parça.

**ARŞINÖLÇƏN** *is. köhn. dan.* Arşınmalçı, bəzzaz, arşınmalı satan tacir. [Əziz bəy:] *Nə karədir ki, bir arşınölçən mənim adaxlıma göz dikə!* M.F.Axundzadə.

**ARTAN** *f.sif.* Getdikcə çoxalan, böyüyən; getdikcə güclənən, şiddətlənən. *Küləyin artan sürəti.*

**ARTÉL** [*rus.*] Müəyyən şərtlərlə birlikdə işləmək üçün düzəldilən təsərrüfat birliyi; birləşmə, şirkət. *Balıqçılıq arteli. – Əminə xalanın işlədiyi corab arteli fəhlələrinin yığıncağı uzun çəkdi.* M.Hüseyn. □ **Kənd təsərrüfatı arteli** – kəndlilərin ümumiləşdirilmiş əməyi və əsas istehsal vasitələri ilə birgə təsərrüfat işləri aparmaq üçün düzələn

sosialist tipli kollektiv təsərrüfat forması; kolxoz. *Kənd təsərrüfat arteli nizamnaməsi kolxoz həyatının əsas qanunu idi.*

**ARTELÇİ** *is.* Artel üzvü.

**ARTERİÁL** *sif. anat.* Arteriyaya aid olan, arteriya ilə əlaqədar olan. *Arterial qan.*

**ARTERİOSKLERÓZ** [*yun.*] *tib.* Arteriya divarlarının qalınlaşıb bərkləşməsindən ibarət xəstəlik; arteriya sklerozu. *Arterioskleroz, əsasən, yaşlı adamlarda müşahidə olunur.*

**ARTÉRİYA** [*yun.*] *anat.* Qanı ürəkdən bədənin müxtəlif üzvlərinə aparan damar. *Arteriya sistemi.*

**ARTEZİÁN quyusu** [*fr.*] Suyu təbii təzyiq altında özbaşına çıxan dərin quyu. *Artezian sularının basqısı. – Bu su artezian quyuları vasitəsilə yerin altından çıxır və bir tərəfdən daim axıb getdiyindən hey təzələnir.* M.İbrahimov.

**ARTICAQ** *zərf köhn.* Bir qədər artıq, bir qədər çox, azacıq çox; daha artıq, artıq. [Ağa Mərdan:] *Məni Hacı Qafurun arvadı yaraşıqlı görsə, əlbəttə, artıcaq sayar.* M.F.Axundzadə. *Amma xalq nə qədər artıcaq elm öyrənə, ol qədər təqsirkar azalar.* "Əkinçi". // Çox, son dərəcə. *Füzuli öz ana dilini artıcaq sevib də ona rövnəq verməyi baş vəzifələrdən birisi hesab edirmiş.* F.Köçərli.

**ARTIQ** *zərf* və *sif.* 1. Çox, çoxlu, xeyli, olduqca, çoxlu miqdarda. [Fəxrəddin:] *Mən dünyada hər şeydən artıq yaltaq adamlardan iyrənirəm.* M.S.Ordubadi. // Daha çox, ziyadə. *Hüsnün olduqca füzun, eşq əhli artıq zar olur*. Füzuli. *Zeynəb daha artıq bir həssaslıq və qayğı göstərirdi.* M.İbrahimov. *Bu səxavətli qonaqların hamısından artıq nədənsə Təbarəkin sovqatlarına fikir verilirdi.* Mir Cəlal.

2. Üstün, irəli, yaxın, qiymətli, yüksək. *Sən mənə hamıdan artıqsan. O kimdən artıqdır?* ☐ **Artıq tutmaq** – üstün tutmaq, irəli tutmaq, daha yaxşı hesab etmək. *Mən inanmıram ki, bizim əsrin şairləri bahar fəslini, məsələn, qış fəslindən artıq tutalar.* C.Məmmədquluzadə. [Həsən] *..zurna çalmağı da özünə sevimli bir sənət intixab edib onu hər şeydən artıq tuturdu.* B.Talıblı.

3. Lazım olduğundan çox, gərəksiz, lüzumsuz. *Artıq yük. Artıq aş ya qarın ağrıdar, ya baş.* (Ata. sözü). [Pəricahan:] B*u qız buradan gedəsidir, artıq söz lazım deyil.* S.S.Axundov. *Qəhrəman, doğrudan da, evdə artıq bəzək-düzək olmağının əleyhinə idi.* S.Rəhimov. ☐ **Artıq bilmək** – lüzumsuz hesab etmək, lazım bilməmək. [Gəldiyev] *əlüstü həll olunan məsələni plana yazmağı artıq bilirdi.* Mir Cəlal. **Artıq danışmaq** – lüzumsuz sözlər danışmaq. // Üstəlik. *Atalar yaxşı deyiblər, çörəyi ver çörəkçiyə, birini də artıq.* M.İbrahimov.

4. *İs. mənasında.* Bütün ehtiyac təmin olunduqdan sonra artıq qalan şey, qalıq. *Artıqları toplayıb bir yerə qoymalı. Süfrənin artığı.*

5. *əd.* Bir işin başlamış olduğunu, yaxud olub bitdiyini bildirir. *Bulud artıq başımızın üstünü almışdı.* – [Gülpəri və İdris] *kəndə yetişəndə artıq gecə idi*. M.Hüseyn. *Adamlar artıq ayaq üstə yeməyə və içməyə başlamışdılar.* M.İbrahimov.

6. *əd.* Daha, bundan əlavə. *Artıq mənim səndən heç bir tələbim yoxdur. – Əlimdəki işləri yoluna qoya bilsəydim, artıq burada durmazdım.* H.Cavid. // Bundan belə. *Artıq mənim yarım deyil xəyalı; Heç bir qaşa bənzətmərəm hilalı.* Ə.Cavad.

**artıq-artıq** *zərf* Həddən artıq, lüzumundan artıq. // Lüzumsuz, yersiz. *Artıq-artıq danışmaq. Artıq-artıq sözlər söyləmək.*

**ARTIQ-ƏSKİK** 1. *sif.* və *zərf* Artıq, lüzumsuz, yersiz, münasibətsiz. [Səlimnaz xanım:] *Mən bu cavan canımdan xeyir görməyim, balam, əgər mən ona artıq-əskik söz demişəmsə.* N.Vəzirov. [Əli:] *Kişi, artıq-əskik danışma! Heyvanları çölə çıxart.* M.İbrahimov.

2. *is.* Çatışmayan, yaxud lüzumundan artıq olan, gərəksiz şey. [Usta Ağabalanın] *elə saqqalı da pərişan halda görünürdü, lazım idi ki, artıq-əskiyini düzəltdirsin.* Çəmənzəminli.

**ARTIQLAMAQ** *f. dan.* Bir şeyin və ya xörəyin başından bir qədər yeyib, artığını qoymaq.

**ARTIQLAŞA** *zərf dan.* Müəyyən edilmiş, nəzərdə tutulmuş miqdardan artıq; üstəlik, əlavə. *Artıqlaşa üç manat verdim.*

**ARTIQLIĞINCA** *zərf dan.* Həddən artıq, lüzumundan artıq, artıqlaması ilə. *Artıqlığınca yemək.*

**ARTIQLIQ** *is.* 1. Çoxluq, bolluq. [Nadir] *iztirabının artıqlığından bozarıb qızarırdı.* B.Talıblı.

2. Üstünlük, yüksəklik. *Bunun artıqlığı nədədir?*

**ARTIQRAQ** *zərf köhn.* Hamıdan artıq, daha artıq. *Gəl mənim tədbiri-bihudəmdə sən bir səy qıl*; *Kim olam bu dərdə artıqraq giriftar, ey həkim*! Füzuli. *Bu səbəblərin ümdəsi onlar*(*ın*) *bizdən artıqraq elm təhsil etməsidir.* "Əkinçi". [Hacı Kamyab:] *Mənim ticarətim Hacı Mirzə Əhməd ağadan artıqraq mənfəət aparır.* Ə.Haqverdiyev.

**ARTIQTAMAH** *sif.* Çox tamahkar.

**ARTIQTAMAHLIQ** *is.* Tamahkarlıq, acgözlülük. *Artıqtamahlıq etmək.* – [Gülsənəm:] [Hümmətəli] *artıqtamahlıq eləyib, vəssalam!* M.Hüseyn.

**ARTIM** *is.* 1. Sayca, həcmcə və s. artma; artan miqdar. *Bəxti bir yanıqlı ah çəkdi: – Artımı çox azdır..* S.Rəhimov.

2. Bişdikdən sonra çörəyin, düyünün və s.-nin çəkisinin artması, bərəkət. *Un çox böyük artım verir. Bu düyünün heç artımı yoxdur.*

**ARTIMLI** *sif.* Çox artım verən, çox artan, çox artıb törəyən; bərəkətli, məhsuldar. *Artımlı düyü.*

**ARTIMSIZ** *sif.* Artım verməyən, artmayan, artıb törəməyən; bərəkətsiz.

**ARTIRILMA** "Artırılmaq"dan *f.is.*

**ARTIRILMAQ** "Artırmaq"dan *məch. Müqaviləyə yeni maddələr artırılmaq. Maşının sürəti artırılmaq. Vəzifəsi artırılmaq. Yükü artırılmaq.*

**ARTIRMA**[1] "Artırmaq"dan *f.is.*

**ARTIRMA**[2] *is.* 1. Eyvan, balkon; əsas binaya yapışıq yüngül tikili. *Artırmada balıq kababı bişirdilər...* A.Şaiq. *Nökər də artırma qapısını açıb .. qonağa yol göstərdi.* Çəmənzəminli. *Həyətin ön tərəfində ikimərtəbəli evin balaca artırmasında ağ örpəkli, qaragöz, qaraqaş bir qız görünürdü.* Mir Cəlal.

2. *məh.* Uşaq oyunlarından birinin adı; eşşəkbeli.

**ARTIRMAC** b a x **artırma**[2]**.**

**ARTIRMAQ** *f.* 1. Miqdarını, çəkisini çoxaltmaq; həcmini, sahəsini böyütmək. *Məhsulu artırmaq. Malların sayını artırmaq. Əkin sahəsini artırmaq. Gəliri artırmaq. – Sən də artır öz əlinlə zəfərlərin sayını!* S.Vurğun.

2. Əlavə etmək, üstünə gəlmək. *Beşin üstünə üç artırmaq. Çayın şirnisini artırmaq. Tezisə yeni maddələr artırmaq.*

3. Gücləndirmək, şiddətləndirmək. *Maşın sürətini artırdı. Ağrını artırmaq. – Məni Seyyid təki çək guşeyi-meyxanələrə; Artırır qəm, dəxi məsciddə nəyim var mənim.* S.Ə.Şirvani. [Novruzun] *bayatıları Bahadırın dərdini daha da artırırdı.* N.Nərimanov. *Şəhərin bu dəhşətli mənzərəsi kəndin Firidunda oyatdığı kədər və qəzəbi daha da artırdı.* M.İbrahimov.

4. Yüksəltmək. *Vəzifəsini artırmaq. Sayıqlığı artırmaq. Gənclərin ictimai həyatda rolunu artırmaq.*

5. *məc.* Böyütmək, şişirtmək, mübaliğə etmək. *Artırma, olduğu kimi söylə!*

6. *məc.* Yaxşılaşdırmaq, təkmilləşdirmək, yüksəltmək. *İxtisasını artırmaq. Biliyini artırmaq.*

**ARTÍKL** [*lat.*] *qram.* Bəzi dillərdə müəyyənliyi və qeyri-müəyyənliyi və bəzən cinsi bildirmək üçün isimlərdən əvvəl işlənən hissəcik. Bəzi dillərdə (məs.: ingilis dilində) artikl dəyişmir, bəzi dillərdə isə (məs.: alman dilində) artikl cins, hal və saylar üzrə dəyişir.

**ARTÍKUL** [*lat.*] Malın, məmulatın tipi.

**ARTİKULYÁSİYA** [*lat.*] *dilç.* Müəyyən səsi tələffüz etmək üçün dodaqların, dilin, damarın, səs tellərinin gördüyü iş; məxrəc.

**ARTİLLÉRİYA** [*fr.*] 1. Müxtəlif quruluşlu və ölçülü toplar. *Artilleriya atəş gücünə görə yüngül, ağır, böyük güclü və çox böyük güclü növlərə bölünür.*

2. Topçu qoşunu.

3. Topların quruluşu, xassəsi və hərbi əməliyyatda tətbiqi haqqında elm; topçuluq elmi. *Artilleriya elminin əsas bölmələri.*

**ARTÍST** [*fr.*] İncəsənət əsərlərinin ifaçısı (aktyor, çalğıçı, müğənni və b.). *Opera artisti. Sirk artisti. Balet artisti. Estrada ar-*

*tisti. – Opera və balet teatrının yaradıcı heyəti Sabirabad və Əli Bayramlı rayonlarına artist briqadası göndərmişdir.* □ **Xalq artisti, əməkdar artist** – dövlət tərəfindən incəsənət sahəsindəki görkəmli xidmətlərinə görə artistlərə verilən fəxri ad.

**ARTİSTLİK** *is.* Artistin sənəti, işi. *Artistlik etmək. Artistliklə məşğul olmaq. Artistlik qabiliyyəti.* □ **Artistlik etmək** *məc.* – təlxəklik etmək, oyunbazlıq etmək, adamları güldürmək. *Baş rolu ifa edən Qudurğana cənabları səhnədə etdiyi oyunbazlığı ilə özünün artistlikdən bilmərrə bixəbər bir bambılı olduğunu sübut etdi.* Ə.Haqverdiyev.

**ARTMA** 1. "Artmaq"dan *f.is.*

2. *is*. Artan şey, artım.

**ARTMAQ** *f.* 1. Miqdarca, ölçücə və s.-də çoxalmaq; bol olmaq, üstə gəlmək. *İnsan oxuduqca, biliyi artar.* // Törəyib çoxalmaq.

2. Şiddətlənmək, güclənmək. *Getdikcə soyuq artır. Dənizdə tufan durmadan artır. – Yuxu gəlməz gözümə, artır azarım gecələr.* M.P.Vaqif. *Bahar fəsildə artar fəğanın, ey bülbül!* S.Ə.Şirvani. *Havanın artar istisi; Daha soyuqluq az olar.* A.Səhhət.

3. Yayılmaq, intişar tapmaq, möhkəmlənmək, güclənmək. *Bütün dünyada demokratiya qüvvələri artır və möhkəmlənir.*

4. *məc.* Tərəqqi etmək, irəliləmək, yüksəlmək, böyümək, kamilləşmək, artıb böyümək. *Yazıçı hər bir əsəri ilə artır. Gənclər quruluşumuzun bütün sahələrində artırlar.*

**ARTRÍT** [*yun.*] *tib.* Oynaqların iltihabı. *Artritin əlamətləri.*

**ARVA** *is. dan.* İçinə şey qoyulan və ya tökülən qabların (qutu, kisə və s.) boş çəkisi, yeri; tara. *Kisənin arvası bir kiloqramdır. Arvasını tutmaq* (qabın boş çəkisini təyin etmək).

**ARVAD** *is.* Qadın. *Arvadlar otaqda çəpik çalıb süzürdülər.* Çəmənzəminli. *Qulu Allahyara cavab verdi: – Arvad xeylağı ilə nə işiniz var?* Mir Cəlal. // Ərli qadın, əri olan, ya olmuş qadın. □ **Arvad almaq** – evlənmək.

**ARVADAĞIZ(LI)** *sif. dan. zar.* Arvadından qorxan, arvadının sözü ilə oturub-duran; ağzıboş, aciz, cəsarətsiz (kişi haqqında). [Fatma xanım:] *Səndə təqsir yoxdur,* [təqsir] *mənim arvadağızlı oğlumdadı.* N.Vəzirov.

**ARVADAĞIZ(LI)LIQ** *is. dan.* Ağzıboşluq, acizlik, cəsarətsizlik.

**ARVADARASI** *sif. dan.* Arvadlar arasında olan; arvadlar arasında baş verən, yaxud arvadlara xas olan. *Arvadarası söhbət.*

**ARVADBAZ** *is. dan.* Qadın düşkünü, arvadların dalınca düşən kişi.

**ARVADBAZLIQ** *is. dan.* Arvadbaz kişinin xasiyyəti, qadın düşkünlüyü.

**ARVADLAŞMA** "Arvadlaşmaq"dan *f.is.*

**ARVADLAŞMAQ** *f. dan.* 1. Getdikcə gəncliyini itirib, yaşlı arvada oxşamaq, yaşlı arvad halını almaq.

2. *məc.* Acizləşmək, cürət və cəsarətini itirmək, ağzının kəsərini itirmək.

**ARVADLI** *sif.* 1. Evli; evi-arvadı olan. *Arvadlı kişilər.*

2. Yanında arvadı olan, arvadı ilə bərabər. *Kişili arvadlı altı adamdır.*

**ARVADLIQ** *is.* Qadınlıq. [Tükəz:] *Bu tüfəng-tapançanın iyirmisin üstünə götürsən, mən bu arvadlığım ilə səndən qorxmaram!* M.F.Axundzadə. [Həmzə:] *Canım, .. gedib arvadlığınızı eləsəniz!* Ə.Əbülhəsən.

**ARVAD-UŞAQ** *is. dan.* 1. Ailə, külfət. *Mir Mustafa xanın özü dağlara qaçıb, arvad-uşağı isə əsir gedib.* Çəmənzəminli.

2. Qadınlar və uşaqlar (bir yerdə). [Hacı Qurban:] *Köç qalıb arvad-uşaq əlində, mənsiz tərpənə bilməzlər, vaxt veriniz köçü yerinə yetirib, gəlim qulluğunuza.* N.Vəzirov. [Tehran] *beləcə yurdsuz-yuvasız arvad-uşaqla doludur.* M.İbrahimov. *Bəlkə Həpir arvad-uşağı qorxuzmaq üçün qəzəblə gəlirdi.* Mir Cəlal.

**ARVADÜZLÜ** *sif. dan.* Arvada oxşayan. *Arvadüzlü kişidən, kişiüzlü arvaddan əlhəzər.* (Ata. sözü).

**ARVANA** *is. məh.* İki hörgüclü dişi dəvə. *Haça buğurlar, dizi qara nərlər, gözəl arvanalar .. qoyun sürülərinin dalınca gəlirdi.* Ə.Vəliyev.

**ARZU** *is.* [*fars.*] 1. Bir şeyin olmasını ürəkdən istəmə; istək, dilək, əməl, həsrət. *Lakin nə göz yaşı, nə də xəyali arzularla azadlıq alınmır!* M.İbrahimov. *Mən də bir insanam, mən də canlıyam; Mənim də qəlbimin arzuları var!* S.Vurğun. *Bu məktubun*

*hər sətrində ürək çırpınır; Böyük arzu, böyük əməl, dilək çırpınır..* R.Rza. ☐ **Arzu etmək** – bir şeyin olmasını ürəkdən istəmək. *Sağ-salamat gedib, qələbə ilə qayıtmanızı arzu edirəm.* M.S.Ordubadi. ☐ **Arzusu ürəyində qalmaq** – istədiyinə çatmamaq. **Arzusu yerinə yetmək** – istədiyi şeyə nail olmaq. **Arzusuna çatmaq** – istədiyinə nail olmaq. [Mehri xanım:] *Gecə-gündüz elədiyim arzulara çatmışam; sənə toy eləmişəm.* Ə.Haqverdiyev. [Kəndlilər] *bu il öz arzularına çata biləcəklərinə şübhə etmirdilər.* M.İbrahimov. **Arzusunda olmaq** – istəmək, bir şeyin həsrətində olmaq.

2. Daxili ehtiyac, həvəs, meyil. *Yemək arzusu. Mənim bu işə heç bir arzum yoxdur.*

**ARZU-KAM** *is.* b a x **arzu** 1-ci mənada.

**ARZUKEŞ** *sif.* [*fars.*] Arzu çəkən, ürəkdən istəyən, arzulayan, bir şeyin həsrətində olan.

**ARZULAMA** "Arzulamaq"dan *f.is.*

**ARZULAMAQ** *f.* Arzu etmək, can və ürəkdən istəmək, bir şeyin həsrətində olmaq, diləmək. *Vətəni arzulamaq. – Dildarə müştaq oldu can, anın camalın arzular.* Nəsimi. *Cəfər əminin arzuladığı möhkəm hökumət gəlib çıxdı.* H.Nəzərli. *Murad üçün ən təəccüblü bu idi ki, bəzi adamlar uşaqdan bezir, tənhalıq arzulayırdı..* Mir Cəlal.

**ARZULANMA** "Arzulanmaq"dan *f.is.*

**ARZULANMAQ** *məch.* Arzu edilmək, ürəkdən istənilmək, həsrəti çəkilmək.

**ARZULU** *sif.* 1. İstənilən, arzu edilən, dinlənilən.

2. Ürəyində arzusu, istəyi, diləyi olan, həsrətli.

**ARZUMAN** *is. köhn.* İstək, ürək arzusu, məqsəd, məram. *Çənlibel oylağım, Qırat dayağım; At minmədən arzumanım qalmadı.* "Koroğlu". *İndən belə ölsəm arzu çəkmərəm; Şükr Allaha, arzumana yetişdim.* M.P.Vaqif.

**ARZUMƏND** *is.* [*fars.*] Ürəkdən istəyən, arzu edən. *Lütf ilə zaman-zaman verib pənd; İslahıma olma arizumənd.* Füzuli. // Bir şeyin həsrətində olan. *Qönçə qılmaz şad, gül açmaz tutulmuş könlümü; Arizuməndi-rüxi-alü ləbi-xəndaninəm.* Füzuli.

**ARZUSUZ** *sif.* Həvəssiz, könülsüz, istəksiz.

**ASAN** *sif.* Zəhmət tələb etməyən, zəhmətsiz yerinə yetirilə bilən, zəhmətsiz əldə edilə bilən, zəhmətsiz rəf edilə bilən; yüngül (*çətin* ziddi). *Asan məsələ. Asan iş. Asan sənət. Asan yol. – Rəsmdir rənc çəkən karını asan eylər.* S.Ə.Şirvani. [Qətibə:] *İndiyə qədər sənin ifa etdiyin vəzifələr bundan asan vəzifələr idimi?* M.S.Ordubadi. *İki oğul qurban vermək asan məsələ deyil.* M.Hüseyn.

**ASANCA(SINA)** *zərf* Asanlıqla, zəhmətsiz, çətinlik çəkmədən. *Məsələni asanca həll etdim. Vəziyyətdən asanca çıxmaq. – Məşədi Əsgər öz-özünə xəyal etdi ki, həqiqətdə həmin qərib müsafirin çamadanını əlindən qapıb qaçmaq çox asanca işdir.* S.M.Qənizadə. [Əhməd] *atası tərəfindən gələn məktubları asanca oxuya bilirdi.* S.S.Axundov.

**ASANLAŞDIRILMA** "Asanlaşdırılmaq"-dan *f.is.*

**ASANLAŞDIRILMAQ** *məch.* Asan edilmək, yüngülləşdirilmək, sadələşdirilmək.

**ASANLAŞDIRMA** "Asanlaşdırmaq"dan *f.is.*

**ASANLAŞDIRMAQ** *f.* Asan etmək, yüngülləşdirmək, sadələşdirmək. *Gediş-gəlişi asanlaşdırmaq. Məsələnin həllini asanlaşdırmaq.*

**ASANLAŞMA** "Asanlaşmaq"dan *f.is.*

**ASANLAŞMAQ** *f.* Getdikcə asan olmaq, daha asan olmaq; yüngülləşmək, sadələşmək. *İşlər asanlaşdı. Neftdən benzin almaq işi xeyli asanlaşmışdır.*

**ASANLATMAQ** b a x **asanlaşdırmaq**.

**ASANLIQ** *is.* Asan şeyin halı; yüngüllük (*çətinlik* ziddi). *Məsələnin asanlığı. Təlim üsulunun asanlığı.*

**ASANLIQLA** *zərf* b a x **asanca(sına)**. [Miss Hanna:] *..Məni çox asanlıqla doğru yoldan azdıra bildilər.* M.S.Ordubadi. *Ağır idman daşlarını* [Gülşən] *asanlıqla qaldırırdı..* Süleymanov.

**ASAR** *is.* [*ər.* "əsər" söz. cəmi] *köhn.* 1. Əlamət, əsər, nişanə. *Ol Məşhədə Zeyd olub mücavir; Asari-sədaqət etdi zahir.* Füzuli. *Bir neçə ildən sonra Yusif Sərrac ki, həddi-büluğa yetişib asari-rüşd özündə mülahizə elədi, təhsili-elm üçün İsfahana getdi.* M.F.Axundzadə.

2. Əsərlər (kitablar və s.). *Bizdən xahişmənd oldular ki, .. milli ədəbiyyatımıza dair bir kitab tərtib qılaq, tainki bizim Azərbaycan şüəra və üdəbamızın əşar və asari və özlərinin nam və nişanələri unudulub, əbnayivətənin xatirindən çıxmasın.* F.Köçərli.

3. Qalıq. *..Heyət üzvlərini gəzdirib, Midiya dövründən qalan köhnə asarı və hökumət binalarını göstərdilər.* M.S.Ordubadi. □ **Asari-ətiqə** *köhn*. – 1) qədim dövrlərə aid mədəniyyət əsərləri, arxeoloji abidələr. *Gəncə şəhəri*(*nin*) *çox qədim və böyük şəhərlərdən birisi olduğuna onun ətrafındakı asari-ətiqə şəhadət verir.* F.Köçərli; 2) *məc.* vaxtı, dövrü keçmiş şey, hazırkı dövr üçün çox qəribə görünən şey. *Tərlan çoxdan görmədiyi bu rəsm-keçidə .. asari-ətiqəyə baxılan kimi baxır*(*dı*). M.Hüseyn.

**ASAYİŞ** *is.* [*fars.*] Əmin-amanlıq, dinclik, sakitlik, nizam və qayda. *Asayişi bərpa etmək. Asayişi pozmaq. Asayişi qorumaq. – Elmlər sayəsində .. insan övladının xoşbəxtlik və asayişinə səbəb olan nəcib icadlar meydana gəlmişdi.* M.F.Axundzadə. *Şəhərdə asayiş və əmniyyəti pozmaq .. istəyənlər olduğu yerində cəzalanacaqdır.* M.S.Ordubadi. // İstirahət. *Rota bu gün vuruşurdu, sabah asayişdə olurdu, bir müddət sonra yenə cəbhəyə gedir, sonra yenə arxaya düşürdü.* Mir Cəlal. // Rahatlıq. *Könül asayişi, canın rahəti; Gülgəz zənəxdanda, tər zəğəndədir.* M.P.Vaqif. *Gözlərindən məni-bədbəxtə bir asayiş yox; Uddurur qan gecələr ol iki bimar mənə.* Q.Zakir.

**ASBÉST** *is.* [*yun.*] *miner*. Odadavamlı maddələr, inşaat materialları və s. hazırlanmasında işlədilən lifli mineral. *Uralda böyük asbest yataqları var.*

**ASDIRILMA** "Asdırılmaq"dan *f.is.*

**ASDIRILMAQ** "Asdırmaq"dan *məch*.

**ASDIRMA** "Asdırmaq"dan *f.is.*

**ASDIRMAQ** "Asmaq"dan *icb.*

**ASEPTİK** *sif. tib.* Aseptika vasitəsilə mikroblardan təmizlənmiş. *Aseptik sarğı.*

**ASÉPTİKA** [*yun.*] *tib*. Yaranı mikroblardan qorumaq üçün ona toxunulacaq bütün şeyləri fiziki vasitələrlə (qaynatmaqla, isti hava verməklə və s.) zərərsizləşdirmə üsulu. *Aseptika qaydaları.*

**ASFÁLT** [*yun.*] 1. Təbii və ya süni surətdə hasil edilən qara rəngli, bərk, qatranaoxşar kütlə (küçələrə döşəmək, lak və s. hazırlamaq üçün işlənir). *Asfalt zavodu. Küçələrə asfalt döşəmək. – Asfaltın boğuq istisi adamın nəfəsini təngidirdi.* M.Hüseyn.

2. *Sif. mənasında.* Asfalt döşənmiş, asfaltlı. *Dəmiryol stansiyasından gələn asfalt yol rayon mərkəzindən keçirdi.* Ə.Vəliyev. *Kombaynın işlədiyindən arxayın olan İkram sürətlə asfalt yola yetişməyə can atırdı.* Ə.Əbülhəsən.

3. Asfaltlanmış yol, küçə, meydança və s. *Burada 8-9 yaşlı uşaqlar oynaşır, asfalt üstündə velosiped sürürlər.* Mir Cəlal.

**ASFÁLT-BETÓN** [*yun.* asfalt və *fr.* beton] Çınqıl, qum və asfalt qatışığından ibarət tikinti materialı. *Asfalt-betonun tərkib hissələri.*

**ASFALTLAMA** "Asfaltlamaq"dan *f.is.* *Asfaltlama işləri. Asfaltlama planı.*

**ASFALTLAMAQ** *f.* Asfalt çəkmək, asfaltla örtmək, asfalt döşəmək. *Küçələri asfaltlamaq. Meydançanı asfaltlamaq.*

**ASFALTLANMA** "Asfaltlanmaq"dan *f.is.*

**ASFALTLANMAQ** *məch.* Asfalt döşənmək, asfalt çəkilmək, asfaltla örtülmək. *Yolların çoxu asfaltlanmışdır. Asfaltlanmalı yer az qalmışdır.*

**ASFALTLANMIŞ** *f.sif.* Asfaltla örtülmüş, asfalt döşənmiş. *Asfaltlanmış küçə. Asfaltlanmış səki.*

**ASFALTLI** *sif.* 1. Üzərinə asfalt çəkilmiş, asfalt döşənmiş, asfaltla örtülü. *Asfaltlı yollar. Asfaltlı küçələr. – "L-1" maşınları çay üstündə uçan qaranquş kimi asfaltlı küçələrlə süzüb gedirdi.* Mir Cəlal. *Beş dəqiqə belə keçməmiş asfaltlı yoldan təzəcə abı rəngə boyanmış "L-1" maşını göründü.* M.Hüseyn.

2. Tərkibində asfalt olan, asfalt qatılmış. *Asfaltlı qatran. Asfaltlı qudron.*

**ASFALTSIZ** *sif.* Asfalt salınmamış, asfalt döşənməmiş. *Asfaltsız yol.*

**ASGÜLÜ** *is. bot.* Rəngi ağ, ya sarı bir çiçək.

**ASILI** *sif.* 1. Asılmış halda olan, asılmış vəziyyətdə duran. *Asılı nərdivan. Asılı*

*paltar. Asılı ip. – Qulam müəllim divardan asılı çantanı endirib açdı və içindəki şeyləri çıxarıb çarpayının bəri başına tökdü.* S.Rəhimov.

2. *məc.* Başqasının iradəsinə, hökmünə tabe vəziyyətdə olan; başqasının yardım və köməyinə ehtiyacı olan, işi başqasından keçən; müstəqil olmayan. *Asılı dövlətlər* (başqa böyük dövlətlərdən asılı olan kiçik dövlətlər). ◻ **Asılı olmaq** – bir səbəbin nəticəsi olmaq, bir səbəblə əlaqədar olmaq, bir şeylə şərtlənmək. *Malın qiyməti keyfiyyətindən asılıdır. Bu iş məndən asılı deyil. – Hər şey adamın özündən asılıdır.* M.Hüseyn.

**ASILILIQ** *is.* 1. Birinin iradəsinə, hökmünə tabelik, birinin yardım və köməyinə möhtac olma; sərbəstliyin, müstəqilliyin olmaması. – *Getdikcə Mirzə Valeh bir asılılıq, bir məhkumluq hiss edirdi.* S.Rəhimov. *Kürd Əhməd böyük .. vəzifə tutan şəxslərin iqtisadi mənafe cəhətdən xarici kapitaldan asılılığını göstərən məqaləni yazacaqdı.* M.İbrahimov.

2. Bir hadisənin başqa bir hadisəyə nəticə və ya səbəb kimi münasibəti. *Bazar qiymətlərinin tələbdən asılılığı.*

**ASILQAN[1]** *is.* Paltar və başqa şeylər asılan taxta və ya dəmir mebel. *Səkinə qarı .. Züleyxanın yüngül boz .. paltosunu aldı və asılqana taxdı.* M.İbrahimov. *Fərhad şinelini çıxardıb asılqana keçirtdi.* M.Hüseyn.

**ASILQAN[2]** *is.* Zəncirə bağlanmış qiymətli daş, qızıl və s. düzəldilmiş bəzək şeyləri.

**ASILMA[1]** "Asılmaq[1]"dan *f.is.*

**ASILMA[2]** "Asılmaq[2]"dan *f.is.*

**ASILMAQ[1]** 1. *t-siz.* Bir yerə ilişib, yaxud bir yerdən tutub sallanmaq. *Budaqdan asılmaq. – ..Bir dəstə gül olaydım; Asılaydım yaxandan.* (Bayatı).

2. *məch.* Bir yerə ilişdirilərək, keçirilərək, bir yerə bənd edilərək asılı vəziyyətə salınmaq. *Bayram günü hər tərəfdə bayraqlar asılır. Ət qənarədən asılmışdır. – Məşədi Əsgər o tərəfə baxıb gördü ki, bir böyük ev var, qapısının üstündə elektrik fənəri asılıbdır.* S.M.Qənizadə. *Dörd-beş mərtəbəli evlərin qabağından Vətən müharibəsi qəhrəmanlarının şəkilləri asılmışdı.* M.Hüseyn.

3. *məch.* Dar ağacına çəkilməklə edam edilmək. *Boğazdan asılmaq. Asılmaq cəzası. – Rəhim bəy keçmiş günlərdən, qaçaq Əbdülkərimin "Sultanbud" təpəsinin üstündə asıldığından, "Qaraçuxa oğlunun" öldürülməsindən və bu gunə keyfiyyətlərindən nağıl edirdi.* Ə.Haqverdiyev. [Əmiraslan] *bir neçə müddət quldurluq edəndən sonra divan tərəfindən tutulub asıldı.* S.S.Axundov. *O gün məlun cinayətkar; Asılacaq boğazından.* S.Vurğun.

**ASILMAQ[2]** *məch.* Bişmək üçün od üstünə qoyulmaq (xörək, qazan. və s.). *Xörək çoxdan asılıbdır. – Gəldiyev gələn kimi düyü islanar, qazan asılardı.* Mir Cəlal. *Bir gün qabaq, həyətdə böyük ocaqlar qurulub, böyük qazanlar asılardı.* H.Sarabski.

**ASILMIŞ[1]** "Asılmaq[1]"dan *f.sif. Qoca usta .. divardan asılmış telefonla kimə isə zəng etdi.* M.Hüseyn. *Divarda mıxdan asılmış balaca çıraq sarı işıqlar salır, uşaqların kölgəsini eybəcər şəkildə böyüdərək yanırdı.* M.İbrahimov.

**ASILMIŞ[2]** *f.sif.* Bişmək üçün od üstünə qoyulmuş (xörək).

**ASIM-ASIM: asım-asım olmaq** *dan.* – dəyərək, yetişərək, səliqə ilə, gözəl bir surətdə asılmaq, sallanmaq. *Yaz girəndə bu bağçanın çiçəkləri bir-birinə qarışır, payız düşəndə rəngbərəng meyvələr asım-asım olurdu.* S.Rəhimov.

**ASIRQAL** *is. bot.* Qarğıdalı şaxına oxşar yarpaqları olan acı ot. *Asırqalın bütün növləri zəhərlidir.*

**ASIRQALLIQ** *is.* Asırqal bitən yer.

**ASİ** *is.* və *sif.* [*ər.*] 1. Üsyançı, hökumət əleyhinə baş qaldıran, hökumətə ağ olan. *..Budaq, Rəhman, Qəhrəman və Səlma bir neçə asi ilə vuruşa-vuruşa səhnəyə daxil olurlar.* A.Şaiq. ◻ **Asi olmaq** – tabe olmamaq, əleyhinə baş qaldırmaq, üzə durmaq, itaət etməmək.

2. *din.* Günahkar.

**ASİ-KİFİR** *sif. dan.* Bu və ya digər səbəb üzündən hirslənmiş, acıqlanmış, narazı, bezikmiş, cana doymuş. ◻ **Asi-kifir etmək** – hirsləndirmək, bezikdirmək, cana doydurmaq. **Asi-kifir olmaq** – bərk hirslənmək, bezikmək, cana doymaq.

**ASİLƏNDİRMƏK** *f.* Üzə qaldırmaq; hirsləndirmək, acıqlandırmaq.

**ASİLƏŞMƏ** "Asiləşmək"dən *f.is.*

**ASİLƏŞMƏK** *f.* Üzə qalxmaq; hirslənmək, qəzəblənmək.

**ASİLİK** *is.* 1. İtaətsizlik, azğınlıq.

2. Günahkarlıq.

**ASİMAN** *is.* [*fars.*] Göy, səma. *Könül pərvaz etdi qalxdı havaya; Yer üzündən asimana yetişdim.* M.P.Vaqif. *Qatar-qatar olub qalxıb havaya; Nə çıxıbsız asimanə, durnalar!* M.V.Vidadi. *İnsan övladının asiman qədər; Ulduzu sayrışan bir lisanı var.* S.Vurğun. ◻ **Asimana bülənd olmaq** – göyə qalxmaq, ucalmaq. *Mübarəkbad sədası xalqdan asimana bülənd oldu və bargahın imarətlərindən əksi-təkrar tapdı.* M.F.Axundzadə. *Səhranın günbatan tərəfindən gördüm bir şölə asimana bülənd olub, işığı hər yeri bürüyübdür.* Ə.Haqverdiyev. *Bir azdan kəndin kənarında çalğı səsləri asimana bülənd olur.* S.Rüstəm.

**ASİMANXƏRAŞ** *sif.* [*fars.*] Çox uca, çox hündür. *Təzəpir məscidinin asimanxəraş minarələri başındakı aypara* [və] *çarlıq dövrünün sönmüş dəhşətlərini nişan verən kilsələr görünürdü.* M.S.Ordubadi.

**ASİMANİ** *sif.* [*fars.*] 1. Açıq-mavi, göy rəngində.

2. Göyə mənsub və aid olan.

3. *məc. şair.* Təmiz, ləkəsiz, pak, müqəddəs mənasında. [Qətibə:] *Çünki şair mənim qeyd etdiyim asimani və nümunəvi kişilərdəndir.* M.S.Ordubadi.

**ASİYALI** *is.* Asiya əhli, Asiya qitəsində yaşayan adam. *Avropanı viran qoyan da asiyalılar olmuş, Avropanı mədəniləşdirən də...* – [Xəlifə Məmun] *Orta Asiyalı məşhur şahmatçı Rəb-rəbi sarayına gətirdərək, tez-tez hüzurunda şahmat yarışları keçirərdi.* Ə.Məmmədxanlı. *Amerikaya beyin axır, .. işıq axır; Bu işığa .. asiyalı gendən baxır.* B.Vahabzadə.

**ASKARİ́D** [*yun.*] *zool.* İnsan və ev heyvanlarının bağırsaqlarında parazitlik edən girdə qurd. *İnsanın bəzi qurdları, məsələn, bizquyruqlar, askaridlər çox vaxt bağırsaqlardan özbaşına və ya ifrazat ilə çıxır.*

**ASKETİ́ZM** [*yun.* askeo – cəhd edirəm] Əxlaqi və yaxud dini ideala çatmaq məqsədi ilə Yer üzərindəki nemətlərdən son dərəcə imtina edilməsi ilə səciyyələnən davranış prinsipi və həyat tərzi.

**ASQI** *is.* Paltar və ya başqa şeylər asmağa məxsus alət. *Bu paltarlı skeletin iti çiyin sümükləri asqı kimi ağ abanı saxlayır.* Mir Cəlal. *Başqa vaxt olsaydı, çoxdan ev adamından biri cumub, onun* [Həmzənin] *paltosunu, papağını alaraq asqıdan asmışdı.* Ə.Əbülhəsən.

**ASQIRDICI** *sif.* Asqırdan, asqırıq doğuran. *Asqırdıcı maddələr. Asqırdıcı qaz.*

**ASQIRIQ** *is.* Burun sinirlərinin birdənbirə qıcıqlanması nəticəsində qeyri-iradi olaraq öskürməyə bənzər səs çıxarmaqla, burun və ağızdan selik püskürmə.

**ASQIRIQOTU** *is. bot.* Asqırtmaq xassəsinə malik olan bir bitki. *Asqırıqotu çoxillik bitki olub, hündürlüyü 1,5 m-ə çatan düz və yoğun gövdəyə malikdir.* R.Əliyev

**ASQIRMA** "Asqırmaq"dan *f.is.* *Tənəffüs yollarına düşmüş toz asqırma və öskürməyə səbəb olur. – Öskürmələr, asqırmalar, boğaz arıtmalar bir-birinə qarışdı.* M.S.Ordubadi.

**ASQIRMAQ** *f.* Burun sinirlərinin birdənbirə qıcıqlanması nəticəsində qeyri-iradi olaraq öskürməyə bənzər səs çıxarmaqla burun və ağızdan selik püskürmək; səbir gətirmək. *Zökəm olanda adam çox asqırır. Qripli adam asqırarkən ağzını dəsmalla tutmalıdır. – Xəstəxanaya çatanacan o nə öskürdü, nə də asqırdı.* Mir Cəlal.

**ASQIRTI** b a x **asqırıq**.

**ASQIRTMA** "Asqırtmaq"dan *f.is.*

**ASQIRTMAQ** *icb.* Asqırmasına səbəb olmaq. *Burunotu adamı bərk asqırdır.*

**ASLAN** *is.* 1. Şir, arslan. *Aslanın pələng və bəbirlə mələzləri də var.*

2. *məc.* Qoçaq, igid, qəhrəman mənasında. *Aslan yatışından da bəllidir. – Bu dağlar qoynunda aslan yatmışdır; Burda Koroğlular at oynatmışdır.* S.Vurğun.

**ASMA** 1. "Asmaq"dan *f.is.*

2. *sif.* Bir yerdən asılan, sallanan. *Asma tərəzinin, əl tərəzisinin yanında və zəncirlərində hədsiz milçək qarasını görüb, Kəblə*

*Novruzqulu özündən çıxırdı.* H.Sarabski. *Uzun çayxanada asma lampa yanırdı.* S.Rəhimov. *Asma otuzluq lampa iş otağına o qədər işıq salıb ki, elə bil gündüzdür.* Ə.Vəliyev. ◻ **Asma körpü** – sahil dayaqlarına bənd edilmiş zəncirlər, yaxud polad burazlar vasitəsilə sallanan körpü. *Asma körpüləri düşmən yıxanda; Dalğalı çayları keçin ayaqla.* S.Vurğun. *Ayaq səsləri asma körpüləri titrədir.* R.Rza.

3. *sif.* Saxlamaq üçün dərilib asılan; asmalıq (meyvə). *Asma üzüm.*

4. *is.* Paltar və s. asmaq üçün qarmaq və s.; paltarasan. [Mədəd] *boz şinelini və gün bozartmış papağını çıxarıb koridordakı asmadan asdı.* S.Rəhimov.

**ASMAQ**[1] *f.* 1. Bir şeyi yuxarıdan bir yerə ilişdirib sallamaq, asılı hala salmaq. *Lampanı asmaq. Divardan şəkil asmaq. – Gülnaz qaçıb, saxsı çırağı yandırdı və tövlənin iç tərəfindən qapının yanından asdı.* M.İbrahimov. *Gəldiyev sözünü bitirəndə cavab gözləməyib, telefonun dəstəyini asdı.* Mir Cəlal.

2. Dar ağacından asmaqla edam etmək, boğazdan asmaq, dara çəkmək.

**ASMAQ**[2] *f.* Xörək və s.-ni ocaq (od) üstünə qoymaq. [Telli:] *Ay Pərzad xala! Yeri onları* [*uşaqları*] *da yığ gətir, bir yerdə yeyək, bozbaş asmışam.* Çəmənzəminli. *Ocağı qalayıb süd qazanlarını qoca kişi ilə ocağa asdıq.* A.Divanbəyoğlu. [Salman] *bir-biri ilə yanaşı iki qara daş qoyub, qazançanı onların üstündən asmışdı.* M.Hüseyn.

**ASMALIQ** 1. *sif.* Bandaq vurulmağa, asılıb saxlanmağa yarar. *Asmalıq üzüm. Asmalıq armud.*

2. *is. məh.* Qaşıqları düzmək üçün ipdən və s.-dən toxunmuş tor, səbət.

**ASORİ** b a x **aysor.**

**ASPÉKT** [*lat.*] Əşya, hadisə və anlayışlara münasibət, nöqteyi-nəzər. *Fəlsəfi aspekt.*

**ASPİRÁNT** *is.* [*lat.*] Elmi-tədqiqat fəaliyyəti üçün hazırlaşan şəxs.

**ASPİRANTLIQ** *is.* Aspirantın işi, vəzifəsi. *Aspirantlıq dövrü.*

**ASPİRANTÚRA** [*lat.*] 1. Ali məktəblərdə və ya elmi-tədqiqat idarələrində professor-müəllim və elmi kadr hazırlama sistemi; aspirantın keçdiyi elmi hazırlıq. [Şeyda:] *..Bitkiçilik institutunda bağçılıq aspiranturasını başa vurmuşam.* Ə.Məmmədxanlı.

2. Ali məktəb və ya elmi idarənin aspirant hazırlayan şöbəsi.

**ASPİRÍN** [*lat.*] *əcz.* Hərarəti azaldan və ya ağrıkəsən dərman.

**ASRAL** *is. bot.* b a x **kəndirotu.**

**ASRALLIQ** *is.* Asral bitən yer.

**ASSA** *dan.* İti və coşqun rəqs ifa edilərkən söylənilən nida.

**ASSİMİLYÁSİYA** [*lat.*] 1. *dilç.* Bir səsin yanındakı səsə bənzədilməsi, məs.: annamaq (anlamaq), atdar (atlar) və s.

2. Bir xalqın başqa bir xalqın dilini, adətlərini və s.-ni qəbul etməsi nəticəsində onun içərisində əriyib getməsi. *Zorakı assimilyasiya.*

3. *biol.* Canlı orqanizmin üzvi maddələri mənimsəmə prosesi. *Assimilyasiya canlıların ən xarakter xassələrindəndir.*

**ASSİMİLYÁTOR** [*lat.*] Hakim millətin dilini, mədəniyyətini, adətlərini və s.-ni zorla məhkum xalqa qəbul etdirməklə, onun milli varlığını məhv etməyə çalışan.

**ASSİMİLYATORLUQ** *is.* Hakim millətin öz dilini, mədəniyyətini, adətlərini və s.-ni zorla məhkum millətə qəbul etdirməyə, onun milli varlığını məhv etməyə çalışması.

**ASSİSTÉNT** [*lat.*] 1. Mütəxəssis köməkçisi; ali məktəblərdə mühazirə oxuyarkən və ya laboratoriya və əməli məşğələlər keçərkən professora kömək edən şəxs. // Xəstəliyin gedişini müşahidə edən, əməliyyat zamanı cərraha kömək edən həkim köməkçisi. // Orta məktəbdə imtahan qəbul edən müəllimə köməklik edən şəxs.

2. Ali məktəblərdə kiçik müəllim vəzifəsi və bu vəzifəni tutan şəxs.

**ASSİSTENTLİK** *is.* Assistentin işi, vəzifəsi. *Assistentlik etmək.*

**ASSORTİMÉNT** [*fr.*] Bir malın müxtəlif növləri; çeşid. *Aptekdə olan dərman assortimentinin demək olar ki, 40 faizini dərman bitkiləri təşkil edir.* R.Əliyev

**ASSURİLƏR** *cəm tar.* Eramızdan əvvəl 3-cü minilliyin axırından VII əsrin axırına qədər Qərbi Asiyanın ən qədim dövlətlərindən biri olan Assuriyanın əhalisi.

**ASSURİŞÜNAS** *is.* Qədim Assuriya tarix və mədəniyyətini tədqiq edən alim.

**ASSURİŞÜNASLIQ** *is.* Qədim Assuriya tarix və mədəniyyətinə aid elmlərin məcmusu. [Konqresdə] *misirşünaslıq, assurişünaslıq, ərəb ölkələrinin tarixi, hindşünaslıq bölmələri.. işə başlamışdır.* (Qəzetlərdən).

**ASTA** *zərf* Yavaş, yavaşca, aram ilə, üsullu, ağır. *Asta qanad çalın, qafil telləri; Heyifdir, salarsız düzə, durnalar!* M.P.Vaqif. *Qaranlıq düşəndə qulağını çat; Asta get, nalının səsini alçalt!* S.Vurğun.

**asta-asta** *zərf* Ağır-ağır, yavaş-yavaş, tədriclə, tələsmədən. *Asta-asta yerimək. Asta-asta danışmaq. – Burada İsa asta-asta başını buladı.* Ə.Əbülhəsən.

**ASTABAASTA** b a x **asta-asta**. *Su gələr asta gedər; Astabaasta gedər; İlqarsız qız yanından; Sağ olan xəstə gedər.* (Bayatı).

**ASTACA** b a x **astadan**. *Qapını astaca döymək. – Furqon astaca cırıldayırdı.* M.İbrahimov.

**ASTADAN** *zərf* Yavaşcadan, səsi çıxmadan, səs çıxarmadan. *Astadan danışmaq. Astadan gülmək. – Qəhrəman astadan zümzümə etməyə başladı.* Ə.Vəliyev. *Cuma astadan soruşdu: – Gədə hanı?..* Ə.Əbülhəsən.

**ASTAGƏL** *sif. dan.* Ağırtərpənən, yavaştərpənən. *Astagəl adam.*

**ASTAQAÇAN** *sif.* Asta gedən, iti yeriməyən, ləngiyən. *Astaqaçan namərddi.* (Məsəl).

**ASTALAŞDIRMA** "Astalaşdırmaq"dan *f.is.*

**ASTALAŞDIRMAQ** *f.* Yavaşıtmaq, bir şeyin sürətini, şiddətini, hərəkətini azaltmaq (tədriclə). *Addımlarını bir az astalaşdır.*

**ASTALAŞMA** "Astalaşmaq"dan *f.is.*

**ASTALAŞMAQ** *f.* Ağırlaşmaq, yavaşımaq, aramlaşmaq.

**ASTALATMAQ** *icb. dan.* Yavaşıtmaq.

**ASTALIQ** *is.* Yavaşlıq, ağırlıq, aramlıq, üsulluluq.

**ASTALIQCA** *zərf* Üsulluca, yavaşcadan; əlaltından.

**ASTANA**[1] *is.* Kandar, qapının ağzı, qapının çərçivəsinin alt hissəsi. *Qız evdən çıxıb qaçan vaxtda ayağı ilişdi astanaya.* C.Məmmədquluzadə. *Molla özünü itirdi; başmağını astanada qoyub oğru pişik kimi sürüşdü.* Mir Cəlal. *Astanada tüstüləyir böyrü batıq samovar.* S.Rüstəm. □ **Astananın ağzında durmaq** *məc.* – lap yaxınlaşmaq, çatmaq. *Fəhlələrdən biri dedi: – Astanamızın ağzında dağ kimi qış durub.* "Kirpi".

**ASTANA**[2] *is.* Su hövzələrində sərt suxurlardan yaranmış çıxıntı. A*bşeron astanası.*

**ASTAR** *is.* 1. Paltarın və ya başqa bir şeyin iç tərəfinə tikilən və ya çəkilən parça. *Yorğan astarı. Paltar astarı. İpək astar. Astar çəkmək.*

2. Ümumiyyətlə, hər hansı bir şeyin iç, dal tərəfi; toxunma şeylərin tərs üzü. *Xalçanın astar tərəfi cod olar.*

3. Divara, qapıya və s.-yə rəng çəkməzdən qabaq, altdan vurulan rəng və s. *Astarın üstündən rəng yaxşı tutar.*

◊ **Astarı çıxmaq** – tamamilə köhnəlmək, dağılmaq, astarı görünmək. **Astarı üzündən baha (başa gəlmək)** – əslində ucuz olan bir şeyin çox baha başa gəlməsi, qoyulan xərci ödəməməsi haqqında deyilir.

**ASTARLAMA** "Astarlamaq"dan *f.is.*

**ASTARLAMAQ** *f.* Astar çəkmək, astar keçirmək. *Yorğanı astarlamaq. Döşəyi astarlamaq.*

**ASTARLANMA** "Astarlanmaq"dan *f.is.*

**ASTARLANMAQ** *məch.* Astar çəkilmək, astar keçirilmək.

**ASTARLATMA** "Astarlatmaq"dan *f.is.*

**ASTARLATMAQ** *icb.* Astar çəkdirmək.

**ASTARLI** *sif.* Astarı olan, astar çəkilmiş. *Astarlı palto. Astarlı yorğan.*

**ASTARLIQ** 1. *sif.* Astara yarar, astar üçün olan. *Astarlıq bez. Astarlıq satin. Astarlıq parça.*

2. *is.* Astarlığa yarar parça. *Mağazadan astarlıq aldım. İpək astarlıq.*

**ASTARSIZ** *sif.* Astarı olmayan, astar çəkilməmiş. *Astarsız palto. – Maral astarsız kostyumunu götürdü.* Ə.Əbülhəsən. *Dəmirov astarsız pencəyini düymələdi.* S.Rəhimov.

**ÁSTMA** [*yun.*] *tib.* Bəzi ürək və bronx xəstəlikləri nəticəsində əmələ gələn təngnəfəslik (xəstəlik). *Ürək astması. Bronxial astma.*

**ASTMALI** *sif. tib.* Astma xəstəliyi olan. *Astmalı xəstə.*

**ASTROBİOLÓGİYA** *is.* [*yun.*] O biri planetlərdə (göy cisimlərində) həyat olub-olmaması problemlərini öyrənən elm.

**ASTROBOTÁNİKA** *is.* [*yun.*] Astrobiologiyanın Günəş sistemi planetlərində fərz olunan bitkiləri tədqiq edən bölməsi.

**ASTROFİZİK** [*yun.*] Astrofizika ilə məşğul olan alim. *Bundan istifadə edərək, astrofiziklər bir çox ulduzların və göy cisimlərinin temperaturunu öyrənirlər.*

**ASTROFÍZİKA** [*yun.*] Astronomiyanın göy cisimlərinin fiziki hadisələrini və kimyəvi xassələrini öyrənən şöbəsi. *Astrofizika göy cisimlərinin buraxdığı şüa enerjisini fiziki üsullarla tədqiq edir.*

**ASTRÓQRAF** *is.* [*yun.*] b a x **teleskop**. Göy cisimlərinin fotoşəklini çəkmək üçün astronomik cihaz. *Astroqrafın ikinci adı teleskopdur.*

**ASTRONAVİQÁSİYA** *is.* [*yun.*] Göy cisimlərinin meridianda hündürlüyünü ölçməklə hərəkət edən obyektin yerini və hərəkət istiqamətini təyinetmə üsulu. *Astronaviqasiya ölçü işləri.*

**ASTRONÁVT** [*yun.*] 1. Astronavtika mütəxəssisi.

2. Uçucu aparatlarda uzaq fəzalara uçan şəxs, təyyarəçi. *Raketin kabinəsində raket mühərrikinin dartı qüvvəsi çəkinin artmasına səbəb olur ki, astronavt da bunu hiss etməlidir.*

**ASTRONÁVTİKA** [*yun.*] Uçucu aparatların fəzalarda uçması haqqında elm.

**ASTRONÓM** [*yun.*] Astronomiya ilə məşğul olan alim.

**ASTRONOMÍK** *sif.* Astronomiyaya aid olan. *Astronomik cihazlar. Astronomik müşahidələr. – Astronomiya elmi inkişaf etdikcə Günəş sisteminin, o cümlədən də Yerin əmələ gəlməsi haqqında müxtəlif astronomik fərziyyələr yaranmağa başladı.* M.Qaşqay.

**ASTRONÓMİYA** [*yun.*] Göy cisimlərini öyrənən elm. *Astronomiya rəsədxanaları. Astronomiya ən qədim elmlərdəndir.*

**ASTRONOMLUQ** *is.* Astronomun işi, sənəti.

**ASTROSPEKTRÓQRAF** *is.* [*yun.*] Göy cisimləri spektrlərinin fotoşəklini çəkmək üçün cihaz. *Prizmalı kamera, yarıqlı və yarıqsız spektroqraflar astrospektroqrafın əsas növləridir.*

**ASTROTURF** *is.* İdman meydançalarında süni ot.

**ASUDƏ** *sif.* və *zərf* [*fars.*] 1. Rahat, dinc, qayğısız, arxayın. *Asudə həyat. Asudə yaşamaq. – Olduz hərəniz bir evin oğlanı, uşaqlar! Asudə gəzin indi bu dünyanı, uşaqlar.* M.Ə.Sabir. *Buna bax, gör necə yatmış burada asudə; Yazmayır, işləməyir, vaxtı itir bihudə.* A.Səhhət. [Mirzağa] *yalnız evlənməklə öz həyatını müəyyən bir şəklə sala bilər, onun sayəsində asudə, rahat bir həyat sürə bilərdi.* S.Hüseyn. **Asudə olmaq** – rahat olmaq. *..Darülfünunda tətildir, zaçotlar gedir; iyunun iyirmisindən sonra tamam asudə olacağam.* Ə.Haqverdiyev.

2. Bikar, işi olmama. [Səttar bəy:] *Bu gün bazar günüdür, bilirəm asudəsən.* N.Vəzirov.

3. Təhlükəsiz, azad, sərbəst, nəzarətsiz. *Ayı özünü asudə görüb, bir müddət kolluqda gəzdi, sonra üzünü meşəyə tərəf tutub getdi.* S.S.Axundov.

**ASUDƏÇİLİK** *dan.* b a x **asudəlik**.

**ASUDƏLƏNMƏK** b a x **asudələşmək.**

**ASUDƏLƏŞMƏ** "Asudələşmək"dən *f.is.*

**ASUDƏLƏŞMƏK** *f.* Asudə olmaq, rahatlanmaq, arxayınlaşmaq, azad olmaq. *Şəhərin* (*havasının*) *qəlizliyindən, tozundan, zəhmətinin kəsrətindən bir qədər asudələşmək .. üçün kəndə rəvan oldum.* Ə.Haqverdiyev.

**ASUDƏLİK** *is.* Rahatlıq, dinclik, sakitlik, arxayınlıq, qayğısızlıq. *Asudəliyə çıxmaq. – Asudəlik istərsən, dünyadan uzaqlaş sən; Keçmişlərə et tövbə, təqsirinə peşman ol.* Heyran xanım. *Əmisi Ağayar haqqında eşitdiklərini asudəliklə* (z.) *fikirləşməyə indi onun* [İkramın] *çox böyük ehtiyacı vardı.* Ə.Əbülhəsən.

**AŞ¹** *is.* 1. Xörək, yemək, bişmiş. *Aşın sıyıqlığı dənin azlığındandır.* (Ata. sözü). *Bəzi yerlərdə təsadüf olunur aşa, ətə.* M.Ə.Sabir.

2. Plov. *Südlü aş. Çığırtmalı aş. Lobyalı aş. Qiyməli aş.*

3. Un, düyü, yarma və s.-dən bişirilən sıyıq xörək; horra.

◊ **Aş bişirmək** *məc.* – tələ qurmaq. *Bütün bu hallar bu gün* [Məşədi Kazım Ağanın] .. *mənim üçün bir "aş bişirdiyini" göstərirdi.* M.S.Ordubadi. [Müşavir:] *Olsun, Osman,*

*sənə bir aş bişirim ki, hər qaşığı bir dad versin.* P.Makulu. **Aşı bişmək** *məc.* – işi bitmək, bədbəxtliyə düşmək. **Aşına su qatmaq** – işini korlamaq, işinə pər qatmaq, işi baş tutmağa qoymamaq, əngəl törətmək. **Aşını-suyunu vermək** – cəzalandırmaq, bərk danlamaq. *Arvadlar bunu gördükdə yazıq soldatın aşını-suyunu verirlər.* H.Sarabski. **Az(acıq) aşın duzu deyil** – çox hiyləgər, bic, araqarışdıran adam haqqında. *Arvad azacıq aşın duzu deyil.* Ə.Əbülhəsən. **Əli aşından da olmaq, Vəli aşından da** – əli hər şeydən çıxmaq, avara qalmaq. **Harada aş, orada baş** – heç bir zəhmət çəkmədən, hazıra gəlib çıxan adam haqqında.

**AŞ²** *is.* b a x **aşı.**

**AŞAFATMA** *is. məh.* Qövsi-qüzeh, göy qurşağı, qarınənə örkəni.

**AŞAĞA**, **AŞAĞI** 1. *is.* Bir şeyin dibinə, yerə ən yaxın olan hissəsinə tərəf, alt (*yuxarı* ziddi). *Dirəyin aşağısı çürümüşdür.* // Sif. mənasında. *Aşağı mərtəbə. Dirəyin aşağı tərəfi.* // *is.* Altlıq. *Heykəlin aşağısı.*

2. *zərf* Yerə doğru, aşağıya doğru. *Aşağı enmək. Aşağı baxmaq. Aşağı düşmək. Aşağı salmaq. Təyyarə aşağı endi. Şəkil çox aşağı asılmışdır.*

3. *is.* Evin, binanın alt mərtəbəsi. *Bu binanın yuxarısı mənzil, aşağısı isə dükandır.*

4. *sif.* Orta səviyyəyə çatmayan, orta normadan az; kiçik, az, qeyri-kafi, zəif. *Aşağı səviyyəli ixtisas. Aşağı hərarət.*

5. *sif.* Ucuz. *Aşağı qiymətlər.* □ **Aşağı salmaq** – ucuzlaşdırmaq. *Qiymətləri aşağı salmaq.*

6. *sif.* Alçaq, pis, nöqsanlı, yararsız, dəyərsiz, keyfiyyətsiz. *Aşağı keyfiyyətli mal.*

7. *sif. məc.* Yoxsul, kasıb. *Aşağı silk. Aşağı təbəqə. Aşağı siniflər.* // Yalnız cəm şəklində: **aşağılar** *məc. köhn.* – aşağı siniflər, aşağı təbəqələr; kütlə. *Aşağılar köhnə qayda ilə yaşamaq istəmirdilər.*

8. *məc. sif.* Vəzifəcə kiçik olan. *Gəldiyev aşağı işçilərin sözünə fikir vermirdi.* Mir Cəlal.

9. Axır, son, qurtaracaq. *Evimiz kəndin aşağısındadır. Mən şəhərin aşağısında yaşayıram.* // Çayın axıb getdiyi tərəf. *Çay aşağı getmək.*

◊ **Aşağı baş** – evin, məclisin, otağın qapıya yaxın olan tərəfi. *Aşağı başda oturtmaq. – Toyxananın qapısında məşəl yandırırdılar. İçəri girdikdə aşağı başdan, yainki yandan sazandalar üçün döşək salınardı.* H.Sarabski. **Aşağılı-yuxarılı** – orta hesabla, orta qiymətlə. **Aşağı salmaq** – 1) devirmək, düşürmək. [Miraxur:] *İndi ki Şah Abbas yoxdur, aya bizə nə manedir ki, bu məlun və bidini, ki deyirlər tənasüximəzhəbdir, təxtdən aşağı salaq..* M.F.Axundzadə; 2) *məc.* hörmətdən salmaq, nüfuzdan salmaq. [Ceyran] *öz işi ilə yoldaşlarını aşağı salmaq niyyətində deyildi.* S.Rəhimov.

**aşağıda** *zərf* Aşağı tərəfdə, alt tərəfdə. *Pəncərədən baxarkən aşağıda bir yığın adam gördüm. Aşağıda çəkməçi yaşayır.* – [Firidun] *şoferə aşağıda gözləməsini tapşırıb, ayağa durmuş yoldaşları ilə vidalaşdı.* M.İbrahimov.

**aşağıdan** *zərf* 1) aşağı tərəfdən, altdan. *Aşağıdan yel vurur. Aşağıdan səs gəlir. Aşağıdan yuxarıya. Aşağıdan tut;* 2) *məc.* kütlələr tərəfindən, kütlənin təşəbbüsü ilə. *Təklif aşağıdan irəli sürülmüşdür;* 3) *məc.* astadan, yavaşdan, alçaqdan, pəstdən. *Aşağıdan oxumaq.*

**AŞAĞI-YUXARI** *zərf dan.* Artıq-əskik, az-çox, təqribən. *Aşağı-yuxarı danışmağına əhəmiyyət verən olmadı.*

**AŞAĞILATMA** "Aşağılatmaq"dan *f.is.*

**AŞAĞILATMAQ** *f.* 1. Aşağı salmaq, endirmək, azaltmaq, salmaq, düşürmək.

2. *məc.* Alçaltmaq, kiçiltmək. *Vəzifəsini aşağılatmaq. Gərək özünü aşağılatmayaydı.*

**AŞBAŞI** *is. məh.* Aşın (plovun) başına qoyulan xuruş (ət, toyuq, quş və s.).

**AŞÇI** *is. xüs.* Dəri, gön aşılayan usta, dabbağ.

**AŞDİBİ** *is.* Qazanın dibində qalan qazmaq qırıntıları qarışıq aş qalığı. *Aşdibi yeyənin toyunda qar yağar, – deyirlər.*

**AŞXANA** *is.* Yeməkxana. *Məktəbin aşxanası. – Şofer dəftərxanaya yapışıq tikilmiş birmərtəbəli aşxananın pəncərəsindən başını çıxardıb cavab verdi.* M.Hüseyn.

**AŞXANAÇI** *is. köhn.* Aşxana saxlayan adam, aşxanaçılıqla məşğul olan adam, aşxana sahibi.

**AŞXANAÇILIQ** *is. köhn.* Aşxanaçının işi, peşəsi.

**AŞI** *is.* 1. *tib.* Yoluxucu xəstəliyə qarşı qoruyucu maddə kimi tətbiq edilən maddə; peyvənd (yoluxucu xəstəliklərin zəifləndilmiş, yaxud öldürülmüş mikroblarından ibarət olan tibbi preparat). *Çiçək aşısı. Difteritə qarşı aşı. Aşı maddəsi Aşı vurmaq.*

2. *xüs.* Dərini, gönü aşılayıb hazırlamaq üçün maddə. *Aşıya qoymaq* (gönü, dərini tükdən təmizləmək üçün xüsusi məhlulun içinə salmaq). – *Evkaliptin yarpaqlarında 5-16 faiz, qabığında isə 7-dən 45 faizə qədər aşı maddələri vardır ki, bunlar gönlərin dabbağlanması üçün işlənir.* İ.Axundzadə.

**AŞIB-DAŞMA** "Aşıb-daşmaq"dan *f.is.*

**AŞIB-DAŞMAQ** *f.* Həddindən artıq olmaq, son dərəcə çox olmaq, bol olmaq; tükənməmək. *Arzular aşıb-daşır. Vətənimizin sərvətləri aşıb-daşır. – Küçəni dolduran insan dənizinin kin və qəzəbi get-gedə aşıb-daşırdı.* M.Hüseyn. *Məhəbbət dəmidir, bahardır bu gün; Qızılgülün aşıb-daşan çağıdır.* N.Rəfibəyli.

**AŞIQ[1]** *is.* Xalq xanəndəsi; həm oxuyan, həm çalan, həm də söz qoşan el sənətkarı. *Xalq aşığı. Aşıq havaları. – Aşığın sözü qurtaranda "neylim-neylim" deyər.* (Məsəl). *El aşıqları incə Azərbaycan dilində xalqımızın mərdliklərini tərənnüm edən ölməz dastanlar qoşurdular.* İ.Əfəndiyev. *Dindir, aşıq qardaş, dindir bir sazı; Onunla gülmüşdür ömrümün yazı.* Z.Xəlil.

**AŞIQ[2]** *is.* 1. *anat.* Diz qapaqlarından çıxan oynaq sümüyü. // Uşaqların aşıq-aşıq oyununda işlətdikləri həmin (adətən qoyunların diz qapağından çıxarılan) sümük. [Tükəz:] *Uşaq aşıq yığan kimi bu qədər pulu yığıb nə edəcəksən?* M.F.Axundzadə. *Uşaq vaxtı küçədə aşıq oynayanda hərdənbir savaşırdıq.* C.Məmmədquluzadə. *Bozbaşı yedikdən sonra, evin uşağı kasalara göz gəzdirərək sümükdən aşıqları çıxardıb bir yerə yığardı.* H.Sarabski.

2. Tağalaq, qarqara, sap sarınan balaca taxta.

3. Tüfəngin çaxmağı ilə ayağı arasındakı məsafə.

◊ **Araz aşığından, Kür topuğundan** – heç bir şeydən qorxusu, çəkinəcəyi olmayan, heç bir dərdi, fikri, qayğısı olmayan, kefi kök adam haqqında. [Əsgər bəy:] *Əlbəttə, bizim Araz aşığımızdandır, Kür topuğumuzdan.* M.F.Axundzadə. [Cənnətəli:] *Mənə də Cənnətəli ağa deyərlər.. Mənim Araz aşığımdandır, Kür topuğumdan...* N.Vəzirov. **Aşığı (maçası) alçı durmaq** – bəxti gətirmək, işi rast gəlmək.

**AŞIQ-AŞIQ** *is.* Aşıqla oynanılan uşaq oyunu. *Aşıq-aşıq oynamaq.*

**AŞIQBOYLU** *sif.* Çox xırda boylu adam. *Birdən bu aşıqboylu kişi ilişdi, çinar kimi yerə gəldi, sonra? Onda gərək ölümü qoyub, dirimi ağlayam.* S.Rəhimov.

**AŞIQHƏNGİ** 1. B a x **aşıqsayağı.**

2. Aşıq kimi, aşıqların etdiyi kimi. [Muzdur] *aşıqhəngi, evi o baş-bu baş hərlənirdi.* Ə.Əbülhəsən.

**AŞIQQOZ** *is. köhn.* Aşıq və qoz ilə oynanılan uşaq oyunu.

**AŞIQLAMAQ** *f. məh.* Aşiq etmək, bənd etmək, məftun etmək. [Camalın anası:] *Xan sağ olsun, Cənnət qızın üstə atıb, qız da bizim bu uşağı .. aşıqlayıb.* S.Rəhimov.

**AŞIQLIQ[1]** *is.* Aşıq sənəti, el xanəndəliyi, saz şairliyi. *Aşıqlıq istedadı. – Bu meydana girib sərdən keçdinmi? Aşıqlıqda başqa-başqa hal olur.* "Aşıq Qərib". *Çıxdım aşıqlığa, düşdüm ellərə; Aşıqlardan san almağa gəlmişəm.* Aşıq Vəli.

**AŞIQLIQ[2]** *is.* Dizin aşıq sümüyü gizləndiyi yeri. *Qoyunun aşıqlığı sınıb, axsayır.*

**AŞIQSAYAĞI** 1. *is. mus.* Aşıq musiqisi səpkisində bəstələnmiş kiçik formalı musiqi pyesi. *Üzeyir Hacıbəyovun aşıqsayağısı.*

2. *sif.* Aşıq paltarına oxşayan, aşıqlara məxsus olan. *..Əmiraslan babanı, öz aşıqsayağı libasını geyən görüb çox şad oldular.* S. Rəhimov.

**AŞILAMA** "Aşılamaq"dan *f.is.*

**AŞILAMAQ** *f.* 1. *tib.* Bir xəstəliyin qabağını almaq, ya başlanmış xəstəliyi sağaltmaq üçün bədənə aşı maddəsi yeritmək, aşı vurmaq, peyvənd etmək. *Uşaqları çiçəyə qarşı aşılamaq. Mal-qaranı aşılamaq.*

2. *k.t.* Cır ağacı peyvənd etmək, qələm etmək, calamaq. // *məc.* Birləşdirmək, uyuşdurmaq, calamaq. *İki gözdən tökülən yaş*

*sanki iki qəlbdən göyərməyə başlamış duyğuları bir-birinə aşıladı*. M.S.Ordubadi.

3. *xüs.* Dərini, gönü aşıya qoymaq.

4. *məc*. Bir adəti, xasiyyəti, fikri, əqidəni, üsulu və s.-ni müxtəlif vasitələrlə başqalarına mənimsətmək, keçirtmək, öyrətmək, tərbiyə etmək. *Musiqi ona* [Bəyimə] *bəzən böyüklük, qüvvət və mətanət hissi aşılayırdı*. Çəmənzəminli. *İndi onun* [Ulduzun] *ürəyindəki sonsuz şəfqət hissi əllərinə, barmaqlarına elə bir .. qüvvə aşılayırdı ki, bu əllərin sarıdığı yaralar sanki daha tez şəfa tapırdı*. Ə.Məmmədxanlı.

**AŞILANMA** "Aşılanmaq"dan *f.is.*

**AŞILANMAQ** *məch*. 1. Bir xəstəliyin qarşısı alınmaq və ya başlanmış xəstəliyin sağaldılması üçün bədənə aşı vurulmaq, aşı maddəsi yeridilmək. *Məktəbdə bütün uşaqlar çiçəyə qarşı aşılandılar. Mal-qara aşılandı. Qoyunlar aşılandıqdan sonra yaylağa sürüldü.*

2. Peyvənd edilmək, calanmaq (cır ağac). // *məc.* Uyuşmaq, birləşmək, calanmaq. *..Sanki bununla da bu iki gənc qadının qəlbi bir-birinə aşılandı*. M.S.Ordubadi.

3. *xüs.* Aşıya qoyulmaq. *Bu gön aşılanmamışdır.*

4. *məc.* Kök salmaq, mənimsənmək. *Yeni üsullar artıq aşılanmışdır.*

**AŞILANMIŞ** *f.sif.* 1. Aşı vurulmuş, aşı maddəsi yeridilmiş.

2. *xüs.* Aşıya qoyulmuş. *Aşılanmış dəri.*

3. *k.t.* Peyvənd edilmiş, calanmış.

4. *məc*. Beyninə yeridilmiş, öyrədilmiş, mənimsədilmiş.

**AŞILAYICI** *sif.* 1. Aşılama işi ilə məşğul olan adam, peyvənd edən. *Aşılayıcı kursları. Aşılayıcı laborantlar.*

2. Aşılayan, aşılamağa məxsus, aşı üçün olan. *Aşılayıcı maddə.*

**AŞILMAZ** *sif.* Çox uca, üzərindən keçilməz. [Yasavul] *özünü .. aşılmaz bir dağ, basılmaz bir qala sayır*(*dı*).. S.Rəhimov.

**AŞINDIRICI** *sif. xüs.* Aşındırma xassəsinə malik olan. *Aşındırıcı maddələr.*

**AŞINDIRILMA** "Aşındırılmaq"dan *f.is.*

**AŞINDIRILMAQ** *məch. xüs.* Kimyəvi üsulla və ya sürtülüb oyulmaq vasitəsilə çuxurladılmaq, naxış açılmaq.

**AŞINDIRMA** "Aşındırmaq"dan *f.is.*

**AŞINDIRMAQ** *f. xüs.* 1. Kimyəvi üsulla və ya sürtüb oymaq vasitəsilə çuxurlatmaq, naxış açmaq.

2. Bir şeyin üzərindəki yazını, naxışı və s.-ni silmək, yox etmək.

**AŞINMA** "Aşınmaq"dan *f.is. İsti və quraqlıq keçən yay fəsillərində asan aşınmaya uğrayan şistlər xırdalanır, qismən toz halına keçir.* M.Qaşqay. *Süxurların möhkəmliyi onların mineraloji tərkibindən, mineralların aşınması dərəcəsindən, kristallararası birləşmə qüvvəsindən və s.-dən asılıdır.* Quliyev.

**AŞINMAQ** *f.* 1. Kimyəvi üsulla, yaxud sürtülüb oyulmaq nəticəsində çuxurlanmaq, naxış açılmaq.

2. Çox sürtülməkdən oyulub çuxurlanmaq, yaxud külək və s. təsiri ilə üstündən çıxıntılar və s. silinib getmək, yox olmaq.

**...aşırı** 1) Bir sıra sözlərlə birləşdirilərək, bir şeyin o biri tayında, o yanında, o üzündə olan mənasında mürəkkəb sifət düzəldilir; məs.: dağaşırı, yolaşırı, dənizaşırı (ölkələr); 2) bəzi isimlərlə birləşdirilərək müəyyən vaxtda təkrar edən, müəyyən fasilə ilə olan, bir gün ötüb o biri gün icra edilən mənasında mürəkkəb sifət, ya zərf düzəldilir; məs.: vaxtaşırı (müəyyən vaxtlarda olan), dövraşırı (müəyyən dövrlərdə olan), günaşırı (bir gün olub, bir gün olmayan). *Günaşırı dərman içmək*.

**AŞIRILMA** "Aşırılmaq"dan *f.is.*

**AŞIRILMAQ** 1. "Aşırmaq"dan *məch*.

2. *t-siz*. Minmək. *Rüstəm atını hündür bir daşa çəkib, onun üstünə aşırıldı*. S.Rəhimov.

3. *t-siz*. Üzərindən atılıb düşmək, aşmaq. *Atdan aşırılıb düşmək.*

4. *t-siz*. Çevrilmək. *O, çarpayıda o tərəfdən bu tərəfə aşırıldı.*

**AŞIRIM** *is.* Dağın beli, dağın aşıb keçmək üçün yararlı yeri. *Aşırımları aşdı, keçirimləri keçdi, özünü Ruma yetirdi*. "Koroğlu". *..Yuxarı aşırıma doğru yönələrkən ovçuya elə gəldi ki, Maral gölünün gözü dolmuşdur*. Ə.Məmmədxanlı. *Bu dağın aşırımlarını .. Murad dəfələrlə Əzizə tərifləmişdi*. Ə.Vəliyev.

**AŞIRMA** *is.* 1. "Aşırmaq"dan *f.is.*

2. Bir şeyin üstündən atılan, sallanan və ya bağlanan bağ.

3. Şalvarı düşməyə qoymamaq üçün çiyindən keçirilib şalvara bənd edilən lentşəkilli qoşa bağ; şalvar asmalığı. *Rezin aşırma.*

◊ **Aşırma atəş** – müharibədə: mərmilərin qabaqda duran qoşunların başı üstündən və ya maneələr (meşə, təpə, kənd) üzərindən atmaqla düşmənin uzaq mövqelərini topa tutma. **Aşırma qatar** *köhn*. – sağ çiyin ilə sol qoltuq arasından keçirilən qatar, patrondaş.

**AŞIRMAQ** *f.* 1. Qaldırıb qoymaq, yükləmək. *Yükü atın belinə aşırmaq. Yeşiyi dalına aşırmaq.*

2. Üzərindən keçirmək, sallamaq. *..Müsyö Jordan firəngi libasında, qıçın qıçı üstə aşırıb, .. lülələnmiş tənbəki yarpağını yandırıb çəkir*. M.F.Axundzadə. *Həcər təkrar papağı başına qoydu, əlini aynalıya atdı, kəməri çiyninə aşırdı*. S.Rəhimov.

3. Üzərindən atmaq. *Vahid üzərində ağırlaşan yorğanı cəld aşırıb dikəldi*. Mir Cəlal. [Heydər] *bu yükü aşırmaq və dərdini boşaltmaq istəyirdi*. S.Rəhimov.

4. Yıxmaq, döndərmək, çevirmək, devirmək, endirmək, düşürmək, salmaq. *Arabaçı dərədə arabanı aşırdı. – Bir az keçmiş kolların arasından güllələr açıldı. Birinci güllə zənbərəkçini aşırıb dəvədən saldı*. Çəmənzəminli. // Diyirlətmək. *Eyvazın briqadasında işləyən bir dəstə iri bir daşı aşıra-aşıra* (z.) *dərənin qırağına gətirirdi.* Ə.Vəliyev.

5. Hündür bir yerin üstündən keçirmək. *Səlim Kərim bəyi meşənin ən sıx yerindən keçirib, təpənin dal tərəfinə aşırdı.* Mir Cəlal.

6. Atlatmaq, keçirmək, yaxa qurtarmaq. *Bu bəlanı da başımızdan aşırdıq.*

7. *məc. dan.* Öldürmək, vurub öldürmək; vurmaq, vurub yıxmaq. *Ovçular dünən üç canavar aşırdılar. – Lidiya bir güllə ilə onu* [düşməni] *aşırdı.* Ə.Əbülhəsən.

8. *məc*. Bir şeyi acgözlüklə və cəld yemək. [Qonaqlar] *sabah açılanda qalxıb, bir cüt .. toyuğun da çığırtmasını aşırdılar.* S.Rəhimov.

9. *məc. dan.* Birinin malını, pulunu və s.-ni mənimsəmək, yemək, udmaq, dağıtmaq, xərcləyib puç etmək.

10. *məc. dan.* Öhdəsindən gəlmək, həll etmək. [Ağamərdan:] *Hacı Rəcəbəli əldə olmasa, bu işi aşırmaq olmaz.* M.F.Axundzadə.

◊ **Alığını aşırmaq** – b a x **alıq. Ayağını başından aşırmaq** – b a x **ayaq**.

**AŞIRTMAQ** *f.* b a x **aşırmaq** 1, 3 və 5-ci mənalarda.

**AŞISIZ** *sif.* Aşı vurulmamış, aşılanmamış. *Aşısız dəri. Aşısız gön.*

**AŞİKAR** [*fars.*] *klas*. b a x **aşkar.** *Bu aşikar bir mətləbdir; bəyana ehtiyacı yoxdur*. C.Məmmədquluzadə. *Birdən-birə göründü gözə bir xərabəzar; Görəsən nə qəmli mənzərələr aşikar idi.* M.Hadi. *Papaqların bəzisi uzun qovun çeşnisində idi. Bunların sahibinin molla və əyandan olmağı aşikar idi*. Çəmənzəminli.

**AŞİQ** *is.* [*ər.*] Birisinə məhəbbət bağlamış, vurulmuş, bənd olmuş adam; vurğun. *Eyləməz xəlvət sərayi-sirri-vəhdət məhrəmi; Aşiqi məşuqdən, məşuqi aşiqdən cida.* Füzuli. *Bu müşəxxəsdi ki, eşq aşiqə qovğa gətirir.* X.Natəvan. *Hər aşiqin ki sən kimi bir gülyanağı var; Lalə kimi əyandı ki, könlündə dağı var.* S.Ə.Şirvani. // Məftun, vurulmuş, aludə. *Mən təbiətin bu gözəlliklərinə aşiqəm. O, öz sənətinin aşiqidir. – Kim ki insanı sevər, aşiqi-hürriyyət olur; Bəli, hürriyyət olan yerdə də insanlıq olur*. M.Ə.Sabir. *Mirzə Səfərin söhbətlərinə hamı aşiqdi. Gözəl danışardı*. Ə.Haqverdiyev. *Dağıtmış yuxumu yenə gözümdən; Əzəldən nəğmələr aşiqiyəm mən.* S.Vurğun. ☐ **Aşiq olmaq** – vurulmaq, məhəbbət bağlamaq; məftun olmaq. *Yarın, bahar mövsümüdür, aşiq olmalı; Canan yolunda ölmək üçün şaiq olmalı.* A.Səhhət. [Səadət:] *Oğlum bir könüldən min könülə Gülnaza aşiq olub.* M.İbrahimov.

**AŞİQANƏ** *sif.* [*ər.* aşiq və *fars.* ...anə] Eşqə, məhəbbətə, sevgiyə aid olan; eşq, məhəbbət, sevgi ifadə edən. *Aşiqanə məktub. Aşiqanə roman. Aşiqanə lirika. Aşiqanə nəzər salmaq. – Mən aşiqəm, həmişə sözüm aşiqanədir*. Füzuli. *Yetişdim kamə, yazdım aşiqanə şeirlər, Seyyid*. S.Ə.Şirvani. *Fəryad elə bir dəm aşiqanə* (z.); *Söylə dili-zarü natəvanə.* M.Ə.Sabir. *Füzulinin özü həqiqi aşiq olduğu üçün kəlamı dəxi başdan-ayağa aşiqanədir.* F.Köçərli.

**AŞİQLİK** *is*. Aşiqin, birinə vurulmuş adamın halı; aşiq olma, eşqə mübtəla olma;

vurulma, bənd olma. *Məndə Məcnundan füzun aşiqlik istedadı var*. Füzuli. *Aşiqlik işinə xeyli pürfənəm; Fərhada, Məcnuna, Vamiqə tənəm.* Q.Zakir.

**AŞİQ-MƏŞUQ** [*ər.*] Bir-birinə bərk vurulma (vurulmuş). ☐ **Aşiq-məşuq olmaq** – bir-birinə bərk vurulmaq. [Bədircahan:] *Züleyxa xanım sənə belə aşkarca aşiq-məşuq olub dinməz-söyləməz.* N.Vəzirov.

**AŞİNA** *is.* və *sif.* [*fars.*] *klas.* 1. Məlumatlı, vaqif, tanış, xəbərdar, bələd**.** ☐ **Aşina olmaq** – tanış olmaq, bələd olmaq.

2. Dost, yaxın yoldaş. *Görən kim oldu bu gülşəndə aşinası gülün?* X.Natəvan. *Biganələrlə çünki olur aşina könül; Kaş olmayaydım ol güli-bixarə aşina.* S.Ə.Şirvani. *Gördüm əğyarın aşinaları var; Vətəni, qövmü əqrəbaları var.* A.Səhhət.

**AŞİNALIQ** b a x **aşnalıq**. *Vaxtında sən aşinalıq etdin; Döndün, belə bivəfalıq etdin.* X.Natəvan. *Əzəldən eylədin mənnən aşinalıq; İndi nədən oldu bu bivəfalıq?* Aşıq Dilqəm.

**AŞİYAN** *is.* [*fars.*] *şair.* Yuva, quş yuvası. *Nə oldu bülbülə kim, qıldı gülüstan tərkin? Unutdu güllərini, etdi aşiyan tərkin*. X.Natəvan. *Orada indi başqa məhəbbət, başqa eşq aşiyan edəsidir*. S.S.Axundov. *De, hansı məclisdə sənsiz oturdum; Bir aşiyan tikib, bir yuva qurdum...* S.Vurğun.

**AŞİYANƏ** [*fars.*] b a x **aşiyan.** *Yəqin ki, şaxi-gül üstündə aşiyanə tikib; O qarə zülf camalında bir pərəstudur.* S.Ə.Şirvani. *Quşlar qayıdıb oxur təranə; Şaxlarda tikirlər aşiyanə*. A.Şaiq.

**AŞKAR** 1. *sif.* Açıq, aydın, göz qabağında olan, bəlli, məlum. *Aşkar məsələ. Aşkar iş.* ☐ **Aşkar etmək** – meydana çıxarmaq, üzə çıxarmaq, bəlli etmək, göstərmək, üstünü açmaq, müəyyənləşdirmək. *Vəziyyəti aşkar etmək lazımdır.* **Aşkar olmaq** – meydana çıxmaq, bəlli olmaq, məlum olmaq, üzə çıxmaq, üstü açılmaq, aydın olmaq. *Məsələ indi aşkar oldu. – Zənn edirəm ki, mətləb burada aşkar olur*. C.Məmmədquluzadə. // *zərf* Açıq, aydın, gizlətmədən. [Hacı Həsən:] *Biryolluq aşkar de ki, Nazlını da verəcəyəm Mir Bağır ağaya*. C.Məmmədquluzadə. *Yox, .. sənin səsində bir titrəyiş var; Gəl məndən gizləmə, aç söylə aşkar!* S.Vurğun.

2. *is.* Həqiqət. [Qurban:] *Pəh, pəh, pəh, belə də dəsgah olarmı, başına dönüm .. bu yuxudur görəsən, a Qulu, yoxsa aşkardır.* N.Vəzirov. [Nisə xala:] *İlahi, bu yuxudur, nağıldır, aşkardır?* Mir Cəlal.

**AŞKARA** *sif. və zərf* Açıqdan açığa, açıq-aydın. [Divanbəyi:] *Mənim mahalımın ortasında aşkara quldurluq quru nağıldır?* M.F.Axundzadə. [Səlimnaz xanım:] *Sən bu gün aşkara dava axtarırsan*. N.Vəzirov. ☐ **Aşkara çıxarmaq** – meydana çıxarmaq, üzə çıxarmaq, bəlli etmək, üstünü açmaq**. Aşkara çıxmaq** – meydana çıxmaq, üzə çıxmaq, bəlli olmaq, üstü açılmaq, bilinmək.

**AŞKARCA** *zərf* (bəzən **aşikarca** şəklində də təsadüf edilir). b a x **aşkara**. *Gəldiyev Muxtarı görəndə yanındakıları aşkarca qovdu.* Mir Cəlal.

**AŞKARLIQ** *is*. Aydınlıq, açıqlıq, göz qabağında olma, zahirdə olma, məlum olma.

**AŞQAL** *sif. məh.* Arıq, döllüyə yaramayan (qoyun).

**AŞQALLANMA** "Aşqallanmaq"dan *f.is.*

**AŞQALLANMAQ** *f. məh.* Pozulmaq, xarab olmaq, cırlaşmaq, yararsız olmaq (qoyun).

**AŞQAR** *is*. Müəyyən məqsədlə bir şeyə əlavə edilən, qatılan başqa maddə; bir şeyin tərkibinə daxil olan maddə, ünsür; xəlitə. *Bu unda aşqar var. – Hamısı Allah bəndəsi .. akulə düyüsünə Tərtər düyüsündən aşqar vurmayan* [adamlardır] Ə.Haqverdiyev. [Üzüm cecəsi] *gil məhlulu üçün əlavə aşqar kimi yarayır*. (Qəzetlərdən).

**AŞQARLI** *sif.* Aşqarı olan, tərkibinə başqa şey, başqa ünsür qatılmış olan.

**AŞQARSIZ** *sif.* Tərkibində başqa şey, başqa ünsür olmayan; heç bir şey qatılmamış; xalis, təmiz. *Aşqarsız un.*

**AŞLAMA** "Aşlamaq"dan *f.is.*

**AŞLAMAQ** b a x **aşılamaq.**

**AŞLANMA** "Aşlanmaq"dan *f.is.*

**AŞLANMAQ** b a x **aşılanmaq.**

**AŞLI** *sif.* Aşa qoyulmuş. *Aşlı gön. Aşlı dəri. – Aşıq Abbas aşlı çarıqlarını yerə sürtə-sürtə mərəkəni süzür, əyilib qalxır, bükülüb açılır, gülməli şeylər oxuyurdu.* Mir Cəlal.

**AŞLIQ** *sif.* Aş üçün, plov üçün yararlı. *Aşlıq düyü.*

**AŞMA** "Aşmaq"dan *f.is.*

**AŞMAQ** *f.* 1. Bir şeyin üzərindən atılıb keçmək, hündür bir şeyin üstünə çıxıb o biri tərəfinə enmək, düşmək, hoppanmaq. *Qapını daldan bağlayaraq, divardan aşıb getdik.* M.S.Ordubadi. *Dərəni aşdım. Meşənin içərisinə cənuba doğru uzanan daşlı-qayalı bir dağ ətəyi ilə gedirdim.* A.Şaiq. *Aşıb şiş dağları, boz səhraları; Gündə bir zəfərlə gedək irəli*. S.Vurğun. *Keçərək Mil düzündən, sıra dağları aşdım; Kürün sahillərilə bütün eli dolaşdım.* Ə.Cəmil.

2. Keçmək, düşmək, çıxmaq. [Sultan və Vəli] *bir bağdan o birisinə aşırlar.* Ə.Sadıq. // Ötmək, atlamaq, keçmək. *Gecə ortasından aşmışdı və yayın isti xamuşluğunu pozan ancaq minarədən gələn minacat səsi idi*. B.Talıblı.

3. Çevrilmək, yıxılmaq. [Göyərçin] *o tərəf bu tərəfə çox aşdı. Ancaq gözlərinə yuxu gəlmədi.* S.Rəhimov. *Ortalıqda yanı üstə aşmış bir neçə dolu butulka .. vardı.* Ə.Əbülhəsən.

4. *məc*. Təmin olunmaq, düzəlmək, əmələ gəlmək. *İşi aşmaq. – Gopnan əməl aşmaz, işə qeyrət gərək olsun*. M.Ə.Sabir. *Güc və zor ilə heç bir iş aşmaz; İş əlində həlim olan çaşmaz.* A.Səhhət. [Məhərrəm:] *Bilirsinizmi, nə var? Belə danışıqdan iş aşmaz.* N.Vəzirov. *Adamlar işi aşan yerdən dördəlli yapışırlar*. Mir Cəlal.

**AŞNA** *is*. 1. Dost, yaxın, tanış, tanış-biliş, yoldaş. *Qəriblikdə yada düşər yanaram; Aşna, yoldaş, yar, müsahib, ellər, hey!* M.V.Vidadi. [Şəhrəbanı xanım:] *Srağagün aşnası zərdablı Qurban bəyə kağız yazdı ki, Şamaxı çəngilərinin vədəsini alsın, toya göndərsin.* M.F.Axundzadə. *Bir neçə il bundan əqdəm İrandan Tiflisə bir aşnam gəlmişdi*. Ə.Haqverdiyev. // Bəzən müraciət yolu ilə deyilir. *Aşna, mən buna razı deyiləm. Aşna, qorxdun ha!* – [Tofiq:] *..Aşna, öz aramızdır, yaxşı ovçusan.* M.İbrahimov. // Bəzən zarafat, istehza, kinayə ilə deyilir. *Bəyin fikrinə gəldi ki, aşnam məni əkmək istəyir.* Mir Cəlal. [Əhməd:] *Özü də aşnamın bu saat işi, deyəsən, yaşdır.* Ə.Əbülhəsən.

2. *köhn.* Qeyri-rəsmi arvad, yaxud kişi; oynaş. [Hacının oğlu] *arvadından savayı, bir rus qızı da aşnası var idi.* Ə.Haqverdiyev. *Cəld qapını açan bu xanım indi aşnasının gəlişindən narazı kimi olmuşdu.* M.Hüseyn.

**AŞNABAZ** *sif. vulq. köhn*. Arvadbaz, aşna saxlayan (b a x **aşna** 2-ci mənada).

**AŞNABAZLIQ** *is. dan.* 1. Bir işə ümumi mənafe nöqteyi-nəzərindən deyil, dostluq, şəxsi münasibət nöqteyi-nəzərindən yanaşma, bir işdə öz dostlarına, yaxın adamlarına üstünlük vermə, tərəfgirlik etmə; dostbazlıq.

2. *zar.* Sevişmə; qadınla-qızla xəlvəti görüşmə. [Kərbəlayı Nəbi:] *Burada aşnabazlıq edirsən?* S.S.Axundov.

3. *vulq. köhn.* Aşna saxlama, qeyri-qanuni arvad saxlama; arvadbazlıq.

**AŞNA-DOST** *top*. Dostlar, bir-birinə yaxın adamlar, dost-aşna. [Cahan:] *Kişi, yenə aşna-dostlarını başına yığmısan, xeyirdirmi?* Ə.Haqverdiyev. [Qulu:] [Adam] *bu dünyada yeyər, içər, aşna-dosta xərclər, kef elər*. S.S.Axundov. *İclas bitdi. Hər kəs öz aşna-dostu ilə danışa-danışa evlərinə getdi*. B.Talıblı.

**AŞNALAŞMA** "Aşnalaşmaq"dan *f.is.*

**AŞNALAŞMAQ** *f.* 1. Dostlaşmaq, yaxınlaşmaq. *Axır vaxtlar onlar çox aşnalaşmışlar.*

2. Bir iş və s. ilə tanış olmaq, bələd olmaq, işə öyrəşib alışmaq. *İşlə aşnalaşmaq. Vəziyyətlə aşnalaşmaq.*

**AŞNALIQ** *is*. 1. Dostluq, yaxınlıq, tanışlıq. *Aşnalıq etmək. Aşnalığı kəsmək.* – [Səkinə xanım:] *Çox-çox razıyam, Ağa Kərim ki aşnalığı unutmayıb, öz dostunun bacısını belə vaxtlarda yad edirsən!* M.F.Axundzadə. [Kitabpaylayan:] *Mən Mirzə Fətəlini yaxşı tanıyıram, özü ilə də qədimdən aşnalığım var.* Ə.Haqverdiyev.

2. Bir işlə tanışlıq, bələdlik, xəbərdarlıq. *Aşnalığın olmayan işdən yapışma!*

**AŞPAZ** *is.* [*fars.*] Xörək bişirən, xörək hazırlayan usta. *Aşpazdan küsən evinə ac gedər.* (Ata. sözü). *Noxudu bozbaşa salanda aşpazı qoyub axund ilə məsləhət eləyirik.* C.Məmmədquluzadə.

**AŞPAZBAŞI** *is*. Baş aşpaz, aşpazların başçısı.

**AŞPAZXANA** *is.* [*fars.*] Mətbəx. *Aşpazxanada yeyir, dulusxanada hürür.* (Ata. sözü). *Nökər cücələri və yumurtaları apardı*

*aşpazxanaya və ulağı sürüb qatdı töyləyə.* C.Məmmədquluzadə. [Ağa Kərim xan:] *Eybi yoxdur, get aşpazxanaya, bir az su versinlər iç, başının ağrısı getsin.* N.Vəzirov.

**AŞPAZLIQ** *is.* Aşpaz sənəti, işi. *Aşpazlıq etmək. Aşpazlıq kursları.*

**AŞSÜZƏN,** *is.* Aşın düyüsünü və s.-ni süzməyə məxsus deşik-deşik qab. *Qəfəs olmadığı üçün alacəhrəni bir gün aşsüzən altında saxladıq.* S.S.Axundov.

**AŞURA** *is.* [*ər.*] *din.* Məhərrəm ayının 10-cu günü (İmam Hüseynin qətl olunduğu gün). *Aşura günü tək bir səhər çağı; Yığdı ərradəyə övrət-uşağı.* Q.Zakir. *Təbriz xalqı aşuradan qırx gün keçənə qədər təziyə saxlardı.* M.S.Ordubadi. *Aşura günü* [adamlar] *nə istəsə və hansı dustağı istəsələr, vəlahəzrət onlara bağışlayır.* P.Makulu.

**AŞÜFTƏ** *sif.* [*fars.*] *klas.* 1. Əhvalı pozulmuş, pərişan, qarışıq. *Şikəstə xatirü məhzun, sözü aşüftə, digərgun; Tutub nəqşi-rəhi-Məcnun, gəzər vəhşi kimi səhra.* Nəbati. *Qurd dedi: çox-çox yanıram halına; Xatirim aşüftədir əhvalına.* A.Səhhət. ☐ **Aşüftə olmaq** – əhvalı pozulmaq, kefi pozulmaq, pərt olmaq, pərişan olmaq. *Şagirdimin bu dərəcədə aşüftə olması məni də məlul etdi.* S.M.Qənizadə.

2. Məftun, dəlicəsinə vurulmuş, aşiq. // İs. mənasında. *Həzər qıl, ey könül, ol zülfi-pürçinin xətasından; Asılmış neçə-neçə sən kimi aşüftələr ondan.* Q.Zakir.

**AŞÜFTƏLİK** *is.* 1. Əhvalı pozğunluq, pərişanlıq. *Oldu, Vahid, xatirimdə cəmkən aşüftəlik; Müttəsil çəkməkdən ol zülfi-pərişan fikrini.* Ə.Vahid.

2. Məftunluq, dəlicəsinə vurğunluq, aşiqlik.

**AŞÜFTƏHAL** *zərf klas.* Əhvalı pozğun, pərişan. ☐ **Aşüftəhal etmək (eyləmək)** – əhvalını pozmaq, məyus etmək, pərişan etmək. *Məni bir zülfi-mişkinin qəmi aşüftəhal eylər.* Q.Zakir**.** **Aşüftəhal olmaq** – əhvalı pozulmaq, məyus olmaq, pərişan olmaq. *Aşüftəhal oldu bu axşam, düzü; Ürək pərisinin pərişan üzü.* S.Vurğun.

**AT¹** *is.* 1. Qoşulan və minilən ev heyvanı. *Kəhər at nalı neylər?! Ağ buxaq xalı neylər..* (Bayatı). *Ata minəndə özünü, atdan düşəndə atı unutma.* (Ata. sözü). *Uca atın üstündə oturub, kəndin alçaq divarlarından həyətin yarısını görürdüm.* C.Məmmədquluzadə. ☐ **At çapmaq** – at qovmaq, at sürməklə yarışmaq. [Heydər bəy:] *Bu necə əsrdir, bu necə zəmanədir? Nə at çapmağın qiyməti var, nə tüfəng atmağın hörməti var.* M.F.Axundzadə. [Sabir:] *Bizim evin böyründəki düzdə çoxlu at çapırlar.* S.Rəhimov. **Cıdır atı** – at yarışında iştirak etmək üçün saxlanılan at. **Minik atı** – ancaq minmək üçün saxlanılan at. **Orta atı** – arabada ortaya qoşulan at. **Yan atı** – arabada və s.-də həmişə yana qoşulan at. **Yedək atı** – ehtiyat üçün yanda aparılan at.

2. Uşaqların at kimi mindikləri ağac və s.

◊ **At başı salmaq** – münasibətsiz və yersiz müdaxilə etmək. **At gücü** *tex.* – mühərrikin qüvvəsini ölçmək üçün ölçü vahidi (saniyədə 75 kiloqram-metrə bərabərdir). **At oynatmaq** – 1) at minib hünər göstərmək, at minməkdə məharət, igidlik göstərmək; 2) *məc.* meydanı boş görmək, meydan oxumaq. **At zavodu** – cins at yetişdirən müəssisə. **Meydana at salmaq** – söhbət zamanı ortalığa, mətləbə dəxli olmayan söz salmaq.

**AT²** *is.* Şahmatda filə bərabər fiqur.

**ATA** *is.* 1. Övladı olan kişi; dədə. *Doğma ata. Ögey ata. Bu uşaq lap atasına oxşayır.* – *Ata olmayan, ata qədrini bilməz.* (Ata. sözü).

2. *məc.* Bir nəzəriyyənin, məsələnin və s.-nin banisi; rəhbər, yolgöstərən. *M.F.Axundzadə Azərbaycan dramaturgiyasının atasıdır.* // *məc.* Himayəçi, tərbiyə verən, pərəstar, yetişdirib böyüdən. *O, bizə ata olmuşdur.*

3. Yaşlı və hörmətli kişiyə xitab, müraciət. // "Atam" şəklində – xahiş, bəzən narazılıq ifadə edir. [Sitarə:] *Atam, apar məni də Kəbənin ziyarətinə.* C.Cabbarlı. [Adamlardan biri:] *Atam, höcət nə üçün? Bu saat bir adam göndərək .. bu məsələni öyrənib gəlsin.* H.Sarabski.

4. Yalnız cəm şəklində: ATALAR – əcdad, ata-baba. *Atalar belə deyiblər. Atalarımızın müqəddəs qəbrini namusla düşməndən qoruduq. Atalar nə əkiblər, oğullar onu biçiblər.*

◊ **Atalar sözü** – ibrətamiz məzmunlu qısa kəlam, ifadə. *Atalar sözündə xalqın dühası*

*əks olunur. Atalar sözündə dərin hikmət var.* **Atası yanmaq** *dan.* – çox əziyyət çəkmək, əldən düşmək, üzülmək, ağır, əziyyətli bir şeyə məruz qalmaq. **Atasına od vurmaq** – b a x **atasını yandırmaq**. **Atasını dalına sarımaq** – b a x **atasını yandırmaq**. **Atasını yandırmaq** *dan.* – 1) şiddətli cəzalandırmaq, divan tutmaq. [Mirzə Turab kəndlilərə:] *Səfər bəyin nə haqqı var sizi bu qədər incidə. Mən onun atasını yandıraram.* B.Talıblı. [Xəlil:] *Qoy bir işlərim yoluna düşsün, mən onun atasını necə yandıraram, özüm bilərəm.* M.Hüseyn; 2) məhv etmək, tamamilə bərbad hala salmaq. *O, bağın atasını yandırıb.* "Kirpi". **Uşaqların atası** *dan.* – evfemizm yolu ilə arvadın öz ərinin adını çəkməmək üçün işlətdiyi ifadə.

**ATA-ANA** *is.* Öz övladına münasibətdə kişi və qadın; valideyn. *Ata-analar öz uşaqlarının tərbiyəsinə fikir verməlidirlər. – Atanı-ananı görməsəydim, özünə xan deyərdim.* (Məsəl). *Tahir .. həm Nərgizin özünün, həm də ata-anasının kefini, əhvalını soruşdu.* M.Hüseyn. [Xeyransa:] *A kişi, mən oğlanı görməmişəm, anası canlara dəyən bir adamdır. Məclislər yaraşığı ..* [olan] *atası var. Hələ ata-ananın övladı pis olmaz.* H.Sarabski.

**ATA-ANALI** *sif.* Atası və anası olan. *Ata-analı uşaq. Atanı-analı böyüsünlər.*

**ATA-ANASIZ** *sif.* Atası və anası olmayan; yetim. *Ata-anasız uşaqlar.* – [Hacı Murad:] *Budur, on iki ildir ki, sən ata-anasız yetimi .. boya çatdırmışam.* S.S.Axundov.

**ATA-BABA** *is.* Əcdad, ulu baba, nəslin ilk baniləri. *Ata-baba yurdu. Ata-baba qaydası. Onun ata-babası kəndli olmuşdur. – Ata-babadan bu məhəllələrə belə bir ad qoyulmuşdu...* N.Nərimanov. [Cahan:] *Sən gəl, ata-baba yolu ilə evlən.* Ü.Hacıbəyov. *Mirzağa Cəmiləni almaq üçün bir yol tapmayırdı. Cəmilənin Bakıda heç bir qohum və əqrəbası yox idi ki, ona elçi göndərib ata-baba qaydası ilə onu istəyə idi.* S.Hüseyn.

◊ **Ata-babadan qalma** – qədim, çox köhnə, dövrü keçmiş, ibtidai. *Ata-babadan qalma üsullar.*

**ATA-BALA** *is.* Ata ilə oğlu, ya qızı. [Hacı Murad:] *İrəli gəl, əyləş. Bir az ata-bala dərdləşək.* S.S.Axundov. *Ata-bala .. parlaq şimal ulduzuna doğru yol aldılar.* Mir Cəlal. □ **Atalı-balalı** – ata ilə oğlu (oğulları), ya qızı (qızları) bir yerdə. *Atalı-balalı bu evin tikilməsində, içərisinin sahmana salınmasında onlar* [Mehman və Gülyanaq] *nələr etməmişdilər.* Ə.Vəliyev.

**ATABİR** *sif.* Bir atadan törəmiş, ata tərəfdən doğma olan. *Atabir qardaş. Onlar atabir, ana ayrı bacıdırlar. – Mənim tək bircə qardaşım var, .. atamın yadigarı, anamın yadigarı, atabir, anabir, doğma qardaş, ruhum və iki gözümün işığı.* C.Məmmədquluzadə.

**ATADANBİR** b a x **atabir**.

**ATADANQALMA** *sif.* İrs olaraq atadan qalmış. *Atadanqalma ev. – .. Hacı Məcid*(*in*) *Diyallı kəndindəki atadanqalma evi məhz iki-üç dənə balaca örtülüdən ibarətdir.* C.Məmmədquluzadə. [Cavad:] *Ay Mirzə! Başına dolanım, atadanqalma bir parça yerim var idi. İndi Səfər ağa gəlib yerimi tutub.* B.Talıblı.

**ATALI** *sif.* Atası olan. *Atalı uşaq. Atalı* (z.) *böyümək.*

**ATALI-ANALI** 1. B a x **ata-analı**. *"Gərdəkdə" gəlin üçün oturmağa bir kürsü qoyub, üstə atalı-analı iki-üç yaşar bir oğlan uşağı oturdarlar.* R.Əfəndiyev.

2. Atası və anası ilə bir yerdə, bərabər.

**ATALIQ** *is.* 1. Ata ilə övlad arasındakı qan qohumluğu. *Atalığını müəyyən etmək. Atalığını danmaq.*

2. Ata üzərinə düşən vəzifə, borc. *Atalıq vəzifəsi. – Etmişik ifa atalıq mehrini; Çəkmişik övladımızın fikrini.* M.Ə.Sabir. [Hacı Murad:] *Hərgah bu mümkün olmasa, atalıq ixtiyarımı əlimə alaram.* S.S.Axundov.

3. Ataya məxsus olan, ataya aid olan. *Atalıq mülk.*

4. Ögey ata. *Rusca əlifba savadını da atalığımdan öyrənmişdim.* Ə.Haqverdiyev. *Axşam atalığım evə gələndə nənəm macəranı ona nəql etdi. O, razı olub məni də özü ilə bərabər fəhləliyə apardı.* H.Sarabski.

5. Ata yerini tutan adam; himayəçi. □ **Atalıq etmək** – ata kimi baxıb böyütmək, tərbiyələndirmək. [Almaz:] *Aftil dayı elə adam deyil, o çox gözəl kişidir. O, mənə lap atalıq eləmişdir.* C.Cabbarlı. *Mursaqulunun atalıq edib böyütdüyü iki bacısı uşaq-*

*ları var idi.* S.Hüseyn. *Bu gündən sonra Qurban Cəlilə yoldaşlıq yox, bəlkə də atalıq edirdi.* İ.Musabəyov.

6. *köhn. məh.* Keçmişdə qız köçərkən atasının oğlan evindən pul və ya qızıl şəklində aldığı başlıq.

**ATAMAN** *is*. 1. *tar.* Rusiyada: kazak vilayətlərində və qədimdə kazak qoşunlarında hərbi inzibati vəzifələrin adı. *Qoşun atamanı. Kazak atamanı.*

2. Rusiyada vətəndaş müharibəsi dövründə: ağqvardiyaçı dəstələrinin başçısı (Ukraynada, Donda və s.-də).

3. *köhn. dan*. Quldur və ya oğru dəstəsi başçısı. // *məc.* Dəstə, yaxud bir qrupun başçısı. *Sən* [Fərman] *"atamanın" .. əleyhinə çıxmaqda çox yaxşı iş görmüşsən..* Ə.Sadıq.

**ATAMANLIQ** *is. dan.* Başçılıq (mənfi mənada). *Atamanlıq etmək.*

**ATASIZ** *sif.* Atası olmayan, ata tərəfdən yetim olan. *Atasız uşaq.* – [Fərhad:] *Deyirlər ki, atasız adam yetim olmaz, anasız yetim olar.* Ə.Haqverdiyev.

**ATASIZ-ANASIZ** *sif.* Yetim. [Piri kişi:] *..Balanı ölümdən xilas etmək üçün bu atasız-anasız yetimi bəlaya salmısan.* S.S.Axundov.

**AT-AT** *is*. Uşaqların ağac üstə minərək oynadıqları oyun. *At-at oynamaq.*

**ATAVÍZM** [*lat.*] *biol*. Çox uzaq əcdadında olmuş xassə və əlamətlərin nəsildə görünməsi. *İnsanlarda .. ulu əcdadlarının çoxdan yox olmuş əlamətləri təkdənbir ayrı-ayrı fərdlərdə zahirə çıxır ki, əcdadın əlamətlərinə bu cür qayıtma hallarına atavizm deyilir.*

**ATAYANA** *zərf* Ata kimi, ataya məxsus bir tərzdə. *Sədr atayana bir səslə: – Oğul, adam bir böyük-kiçik bilər, sözünün yerini bilər, axı.* M.İbrahimov.

**ATBAZ** *is.* [at və *fars.* ...baz] Son dərəcə at sevən adam, at həvəskarı. [Berezovski:] *Hərgah siz atbaz deyilsinizsə, ata həvəsiniz yoxdursa, o atı mənə satın.* M.S.Ordubadi. *Məlik Cümşüd də uşaqlığından yaman atbaz olduğundan, şirnikib getmişdi.* (Nağıl).

**ATBAZLIQ** *is.* Həddindən artıq at sevmə, at həvəskarı olma.

**ATCIL** *sif. dan.* Atı, at saxlamağı həddindən artıq sevən. *Bundan sonra ağsaqqal həkim atcıl əmisinin qocalan vaxtı atdan nə cürə yıxıldığını xatırlayıb, özünə bəraət qazandırmaq istədi.* S.Rəhimov.

**ATÇAPAN** *is*. Cıdır iştirakçısı; jokey.

**ATÇAPDI**, **ATÇAPMA** *is.* Cıdır. *Milli at oyunları və atçapma yarışları.*

**ATÇI** *is.* Ata baxan, at saxlayan. // Yaxşı at minən adam; atbaz.

**ATÇILIQ** *is.* At saxlama, at yetişdirmə. *Qədim skiflərin atçılıq təsərrüfatları olmuşdur.* – *Əhalinin bir qismi kənd təsərrüfatı – əkinçilik, bağçılıq, dəyirmançılıq, atçılıq və maldarlıqla məşğul olardı.* H.Sarabski.

**ATÇİBİNİ** b a x **atmilçəyi**.

**ATDIRILMAQ** "Atdırmaq"dan *məch.*

**ATDIRMA** "Atdırmaq"dan *f.is.*

**ATDIRMAQ** 1. "Atmaq"dan *icb.f. Tonqala atdırmaq.*

2. *f.* Kəsmək, üzmək. [Koxa] *xəncəri çıxarıb pişiyin boynunu atdırdı.* S.Rəhimov.

3. *f.* Maşın və s. vasitəsilə didib təmizləmək (yunu, pambığı).

**ATEİST** [*yun.*] Ateizm tərəfdarı, allahsız. *Ateist fikrin tarixi. Ateist görüşlərin rüşeymləri. Ateist baxış və əqidəsi.*

**ATEÍZM** [*yun.*] Allahın varlığını, fövqəltəbii qüvvələri və dinləri elmi biliklərə əsasən inkar etmə; allahsızlıq. *Ateizmin izləri. Ateizmin nəzəri əsası materialist fəlsəfədir. Ateizm tərbiyəsinin bir əsas vəzifəsi də dinin elmə zidd olduğunu sübuta yetirməyə çalışmaqdan ibarət idi.*

**ATELYÉ** [*fr.*] Rəssam, heykəltəraş, fotoqraf və s. emalatxanası. // Ümumiyyətlə emalatxana. *Soyuducu cihazlar təmir olunan atelyelərin sayı artırılır. Yeni tikilən binanın birinci mərtəbəsində fərdi ayaqqabı atelyesi açılmışdır.* ◻ **Moda atelyesi** – dərzixana, dərzi emalatxanası.

**ATƏŞ** *is.* [*fars.*] 1. Od. *Atəşin təqazası yandırmaqdır. O xasiyyət daim onda büruz edər.* "Əkinçi". *Hər tərəfi atəş sarımış, alovların təşkil etdiyi atəşin dairə dəqiqəbədəqiqə daralmaqda idi.* A.Şaiq. *Ocağın alovu sönüb tamam olurdu. Qıraqlarındakı atəşləri kül yavaş-yavaş cavanlığı qocalıq bürüyən kimi bürüyürdü.* A.Divanbəyoğlu. // Ocaq mənasında. *Atəş kənarı qış gününün laləzarıdır.* (Ata. sözü). // *məc*. Klassik ədəbiyyatda adətən izafət tərkiblərində işlənir.

*Atəşi-eşqindən dil kabab olmuş; Dolanır, çevrilir pərvanələnmiş.* M.V.Vidadi. *Görən saətdə zövqümdən yıxıldım məstü layəqəl; Dağıldı əql başımdan, alışdı atəşi-sevda.* Nəbati.

2. *məc.* İşıqsaçan şey, işıqsaçan nöqtə. *Uzaqdan şəhərin saysız-hesabsız atəş nöqtələri görünürdü.*

3. *məc.* Qızğınlıq, coşqunluq, hərarət, ehtiras mənasında. *Gözləri atəş saçır. – Nəriman, içində alovlanan bir atəş duydu.* Mir Cəlal.

4. Tüfəng və ya topdan atış. *Hər atəşdə, hər hücumda düşmənlərə hər səfər; "Hədiyyələr" göndərirdik isti-isti güllələr!* S.Rüstəm. *Atəş halqasını keçib yönəldim; Dərhal məntəqənin üstünə gəldim.* M.Rahim. *Düşmən qurtara bilmir atəşindən başını.* M.Seyidzadə. ☐ **Atəş açmaq** – 1) tüfəng və s.-dən atmağa başlamaq. *Bu halda müsəlləh atlı kazaklar və jandarmlar camaatın qarşısını alaraq atəş açdılar.* S.S.Axundov. [Nikitin] *avtomatdan arasıkəsilməz atəş açdı.* M.İbrahimov; 2) b a x **atəşə tutmaq** 2-ci mənada. *Dəmirov rayonun vəziyyətini ətraflı təhlil edərək, öz məruzəsində kəsirlərə qarşı atəş açmış*(*dı*). S.Rəhimov. **Atəşə tutmaq** – 1) gülləyə basmaq, topa tutmaq. [Qəhrəman:] *Mən burada dörd nəfər yoldaşım və bir pulemyot ilə həm körpünü, həm də meydanı yaxşıca atəşə tuta bilərdim.* H.Nəzərli. *Tuturlar onları qafil atəşə; Gizləyir dostları qalın bir meşə.* M.Rahim; 2) şiddətli tənqid etmək (bu mənada, adətən, "tənqid atəşinə tutmaq" şəklində işlənir). **Atəş xətti** *hərb.* – atılan güllə və mərmilərin təsir dairəsi. *İndi artıq Moskva atəş xəttindən uzaqdadır.* M.Hüseyn. **Yaylım atəşi** – b a x **yaylım.** // Atəş açmaq üçün hərbi komanda: atəş!

**ATƏŞBAR** *sif.* [*fars.*] *şair.* Od yağdıran, qızğın, hərarətli. *Batdı əncüm, çıxdı gün, ya bir əsiri-eşqdir; Tökdü dürri-əşkü çəkdi ahi-atəşbar sübh.* Füzuli. *Məktəbi-qəmdə bu dərs olmuş lisanım əzbəri; Tiri-atəşbari-qəmdən dağidar olmuş cahan.* M.Hadi.

**ATƏŞBAZ** *is.* [*fars.*] 1. Yanar və partlayıcı maddələrdən bəzəkli, rəngbərəng işıqlar verən fişənglər və s. hazırlayan usta; fişəngçi, pirotexnik.

2. Odla tamaşa göstərən adam.

**ATƏŞBAZLIQ** *is.* 1. Yanar və partlayıcı maddələrdən bəzəkli, rəngbərəng işıqlar verən fişənglər və s. hazırlama işi; pirotexnika.

2. Əlvan və bəzəkli işıqlar verən fişənglərlə keçirilən şənlik. *Məmmədhəsən mirzə də böyük bir atəşbazlıq düzəltmişdi.* M.S.Ordubadi. *Balaca uşaqlar təzə paltar geyərdilər və məşhur olan oyunlardan "kos-kosa" oynardılar, cahıllar isə atəşbazlıq edərdilər.* H.Sarabski. *O təpələrdə elə bil atəşbazlıq nümayiş etdirilirdi.* Ə.Əbülhəsən.

**ATƏŞBÖCƏYİ** *is. zool.* Üst qabığı fosforla örtülü olduğundan qaranlıqda işıq saçan böcək.

**ATƏŞFƏŞAN** *sif.* [*fars.*] Atəş saçan, od püskürən; çox parlaq. *Yaşıl çəmən üstü gün atəşfəşan; Parıldayır lacivərdi-asiman.* A.Səhhət.

**ATƏŞFƏŞANLIQ** b a x **atəşbazlıq** 2-ci mənada. *Müsamirədə dövlət filarmoniyasının .. artistləri də iştirak edəcəkdilər. Axırda atəşfəşanlıq olacaqdı. – Qaynaq şamlarının gözqamaşdırıcı qığılcımları ətrafa sıçradıqca, bayram günləri düzələn atəşfəşanlığı xatırladırdı.* Əlizadə.

**ATƏŞGAH** *is.* [*fars.*] 1. B a x **atəşgədə**. *Tam bu sırada Solmaz atəşgah qapısında görünür..* C.Cabbarlı. *Sonralar Suraxanı kəndində tikilmiş atəşgah indi də durur.* M.Hüseyn.

2. Odluq, od yandırılan yer.

**ATƏŞGƏDƏ** *is.* [*fars.*] Atəşpərəstlərin ibadətgahı, məbədi. *Suraxanı atəşgədəsi. Atəşgədələrdə müxtəlif dini ayinlər icra edilir, qurbanlar kəsilirdi. – Hər şəhərdə və kənddə bir və ya bir neçə atəşgədə var idi.* Ə.Haqverdiyev.

**ATƏŞXANA** *is.* [*fars.*] Od yanan yer, ocaq, odluq.

**ATƏŞİN** *sif.* [*fars.*] Odlu, od kimi isti. *Qan-yaş tökübyanında gəzər atəşin kəbab; Məşuqə bənzər atəşü aşiq kəbab ona.* Füzuli. // *məc.* Qızğın, hərarətli, ehtiraslı. *Atəşin salam. – Natiq atəşin bir nitq söylədi.* M.S.Ordubadi. *Dinləyin yanğılı sədalərini; Eşidin atəşin nəvalərini.* M.Ə.Sabir. *Həsən bəy Zərdabi, dövrünün qabaqcıl adamı və Azərbaycan torpağının atəşin vətənpərvəri*

*idi.* M.İbrahimov. // Coşqun, dəliqanlı. *Cünun səhrasının məcnunları vardır, vəli, Qövsi; Bu meydan bir sənintək atəşin cövlana layiqdir.* Qövsi.

**ATƏŞİNLİK** *is*. Qızğınlıq, hərarətlilik, ehtiraslılıq.

**ATƏŞKEŞ** *is*. [*fars.*] Ocaqdan od çəkmək üçün dəmir alət.

**ATƏŞKƏS** *is*. Müharibə aparan tərəflər arasında atəşin müvəqqəti dayandırılması. *Atəşkəs rejiminin pozulması.*

**ATƏŞQURDU** b a x **atəşböcəyi**. *İsti tərəflərin dəryalarında çox kiçik, şəfəqli heyvanlar – atəşqurdları olur.* H.Zərdabi.

**ATƏŞLƏNDİRİLMƏK** *məch*. Odlandırılmaq, alovlandırılmaq, alışdırılmaq.

**ATƏŞLƏNDİRMƏ** "Atəşləndirmək"dən *f.is.*

**ATƏŞLƏNDİRMƏK** *f.* Odlandırmaq, alovlandırmaq, alışdırmaq.

**ATƏŞLİ** *sif.* 1. Hərarətli, odlu, qızğın, alovlu. // *məc.* Çox təsirli.

2. *məc.* Coşqun, ehtiraslı, dəliqanlı. [Şeyda:] [Gavə] *atəşli bir qəlblə inqilab başladı, öylə xunxar məğrur bir hökmdarın* [Zöhhakın] *taxtını başına çevirdi.* H.Cavid. *Bu bəlkə onun* [Nizaminin] *atəşli fikirləri idi ki, gözlərində odlu qanad çalırdı.* Ə.Məmmədxanlı.

**ATƏŞLİK** *is.* Od yanan yer, od qoyulmağa məxsus yer; odluq, külxan.

**ATƏŞLİLİK** *is*. 1. Odluluq, alovluluq, hərarətlilik.

2. *məc.* Coşqunluq, qızğınlıq, dəliqanlılıq, ehtiraslılıq.

**ATƏŞNAK** *sif.* [*fars*.] 1. Odlu, atəşin, hərarətli, qızğın.

2. *məc.* Çox təsirli.

**ATƏŞPARƏ** *is*. [*fars.*] Od parçası, qığılcım, şərarə.

**ATƏŞPƏRƏST** *is.* [*fars.*] İbtidai cəmiyyətdə: oda ibadət edən, odu ilahi qüvvə sayıb ona sitayiş edən adam. *Atəşpərəstlərin öz kitablarından alınan tarixi xəbərlər oxucular üçün həm yeni və həm də maraqlı ola bilər.* M.F.Axundzadə.

**ATƏŞPƏRƏSTLİK** *is.* Oda sitayiş etmə, atəşpərəstlərin dini. *Hələ tarixi miladidən çox-çox əvvəl, atəşpərəstlik meydana çıxdığı zaman bizim qədim babalarımız bir sıra atəşgahlar qurub, oda sitayiş edərlərmiş.* M.Hüseyn.

**ATƏŞRƏNG** *sif.* [*fars.*] Od rəngli, od rəngində olan; qırmızı. *Atəşrəng şərab.*

**ATƏŞZAR** *is*. [*fars.*] Odluq, od olan yer.

**ATƏŞZƏBAN** *sif.* [*fars.*] Odlu danışan, ağzından od tökülən, son dərəcə təsirli söz və ya nitq söyləmək qabiliyyəti olan; sözükəsərli, yaxşı natiq.

**ATƏVƏLİYİ** *is*. *bot.* Çoxillik bir bitki. *Atəvəliyi çoxillik bitki olub yerüstü gövdəsinin uzunluğu 1,5 m-ə çatır. Kökyanı yerüstü gövdəsinin aşağı hissələrindəki yarpaqları çox böyük olur.* R.Əliyev

**ATIB-TUTMAQ** *f.* 1. Bir şeyi əlləri ilə yuxarıya atmaq və yerə düşərkən tutmaq. *Paltarlarımızı tamam çıxarıb adama bir fitə tutardıq və sonra on-on beş girvənkə gələn ağac milləri atıb-tutardıq, oynadardıq. Günümüz elə zorxanada keçərdi.* Çəmənzəminli. // Sevgi və hörmət əlaməti olaraq, bir adamı əlləri üstündə yuxarı atmaq və tutmaq. *Vahid Nəzirəni qolları arasına alıb oynadır, top kimi atıb-tuturdu.* Mir Cəlal. // *məc.* Əzizləmək. [Dilbər:] *Alik deyir: – Siz mənim olsaydınız, gecə-gündüz sizi atıb-tutar, bir kukla kimi oynadardım.* C.Cabbarlı.

2. *məc. dan.* Ətraflı düşünmək, ölçüb-biçmək. *Məsələni qabaqca atıb-tutmaq lazım idi.*

**ATICI** 1. *sif.* Yaxşı tüfəng atan, yaxşı nişan vuran; mahir nişançı. // *tar.* Nişançı. *Fəhlələrdən təşkil edilmiş atıcı dəstələri birinci gün lazımi kömək göstərə bilmədilər..* A.Şaiq. // İs. mənasında. *Cavanşir elinə mənsub sallağı bığlı, qolsuz kürklü atıcılar var idi.* Çəmənzəminli. [Qoca:] *Belə tuşqul atıcı mən görməmişəm, qarovullamağı da çox uzaq çəkmədi, amma yenə düz vurdu.* A.Divanbəyoğlu.

2. *is.* Yun və pambıq kimi şeyləri xüsusi alətlərlə didib yumşaldan usta, fəhlə; həllac.

**ATICILIQ** *is.* 1. Yaxşı tüfəng atmaq, nişan vurmaq qabiliyyəti; mahir nişançılıq. *Müasir atıcılıq idmanı. – Getdikcə Camalın ovçuluq və atıcılıq şöhrəti hər yana yayılırdı.* S.Rəhimov.

2. Yun atmaq, pambıq atmaq sənəti; həllaclıq.

**ATIL-BATIL** *is. bot.* Cənub rayonlarında yayılmış quraqlıqsevən çoxillik bitki.

**ATILMA** "Atılmaq"dan *f.is.*

**ATILMAQ** 1. "Atmaq"dan *məch.*

2. *t-siz.* Bir şeyin üstündən hoppanmaq, hoppanıb tullanmaq. *Xəndəkdən atılıb keçmək.* // Hündür yerdən aşağıya tullanmaq, tullanıb düşmək. Barıdan atılmaq. *Barıdan atılmaq. Dənizə atılmaq. Pəncərədən atılmaq.*

3. *t-siz.* Cəld yönəlmək, yerimək, yüyürmək, cummaq; üz tutmaq; özünü atmaq. *Hamı səs gələn tərəfə atıldı. – Atıl cəbhələrə aslanlar kimi...* S.Vurğun. *Ağabəyim şən addımlarla atılaraq otaqdan çıxdı.* Çəmənzəminli. *Məhbusi tez həyətdən küçəyə lampa işığına atıldı..* M.İbrahimov. // *t-siz.* Sıçramaq, hücum etmək.

◊ **Atılıb-düşmək** – 1) qalxıb düşmək, tərpənmək, enib-qalxmaq; 2) çalışıb-çapalamaq, əlləşmək, vurnuxmaq; çox oynamaq, hərəkət etmək. [Şahnisə xanım:] – *Ay qara qız, – dedi, – deyəsən yorğunsan, bənizin qaçıb. Axşam sənə dedim ki, az oyna, az atıldüş.* Çəmənzəminli; 3) etiraz etmək, narazılıq göstərmək, müqavimət göstərmək. *Çox atılıb-düşmək. Nə atılıb-düşürsən?* – [Gövhərtac:] *Bir iki gün atılıb-düşüb yerində əyləşəcək.* Ə.Haqverdiyev; 4) (bəzən "sevincindən", "şadlığından" sözləri ilə) çox sevinmək, şadlanmaq, özündən çıxmaq. [Kərim baba] *nişanladığını vurduqda, bütün arzularına qovuşmuş bəxtiyar bir uşaq kimi sevincindən atılıb-düşərdi.* A.Şaiq.

**ATIM** *is.* 1. Atmaq işi.

2. Yalnız bir, iki və s. sözü ilə: **bir atım** – bir dəfə atmağa, işlədilməyə, bir dəfəliyə kifayət edəcək miqdar. *Bir atım çay. Bir atım barıt.*

**ATIM-ATIM** *zərf* Dağılmış, tökülmüş, səpələnmiş halda. [Leyla] *pambıq kimi atım-atım edilmiş evdə, əli qoynunda oturub Qulamı gözlədi.* Mir Cəlal.

**ATIŞ** *is.* Tüfəng, tapança və s. atmaq işi və üsulu. *Atış meydanı.*

**ATIŞMA** *is.* 1. İki tərəfin, ya iki adamın qarşı-qarşıya durub bir-birinə güllə atması, atəş açması. *Tətillər, atışmalar, üsyanlar, axırda isə işçilər hakimliyi, zəhmət ağalığı Məhərrəmin gözləri önündə canlandı.* H.Nəzərli. // Vuruşma (odlu silahla). *Bir atışma başlandı, Əsəd bəyə güllə dəydi, yaralandı, vəssəlam!* C.Cabbarlı. *Məscid qarşısında böyük bir atışma davam edirdi.* S.Hüseyn. [Səlma:] *Göydə mütləq qanlı atışma var; Yoxsa yenə çarpışırmı qaçaqlar?* H.Cavid. *Çox çəkmir ki, kənddə böyük atışma qopur.* Ə.Vəliyev.

2. *məc.* Sözləşmə, bir-birinə ağır sözlər demə; söyüşmə, dava-dalaş.

**ATIŞMAQ** *qarş.* 1. Qarşı-qarşıya durub, bir-birinə güllə atmaq. [Mahmud:] *Bəy də beş-on nökərləri ilə bir daldaya girib camaatla atışır.* Ə.Haqverdiyev. *Adamlar həmişə qorxurdular ki, bu saat* [qoçular] *atışacaq və arada yoldan keçən təqsirsiz adamlara güllə dəyəcək.* H.Sarabski. // Vuruşmaq (odlu silahla). *Midhət .. nəinki yaxşı və məharətlə uçmağı, bəlkə düşmən təyyarələri ilə sərrast atışmağı da bacarır.* Ə.Vəliyev.

2. Atışda, nişançılıqda yarışmaq.

3. *məc. dan.* Bir-birinə ağır sözlər demək, söyüşmək, dalaşmaq. *Onlar bir-biri ilə bərk atışdılar. Qonşulardı – atışırlar.*

**ATİ** *is.* [*ər.*] *köhn. şair.* 1. Gələcək. *Onda guya gülümsəyir ati.* C.Cabbarlı.

2. Yer. halında: **atidə** – aşağıda, altda. *Nuxa şairlərindən məşhur İsmayıl bəy "Nakam" təxəllüs Füzulinin atidə zikr olunan müsəddəsinə yazdığı bir nəzirə xeyli* [gözəl və bəyənilən] *kəlamlardan biridir.* F.Köçərli. *Cani-ədəbü elmə məkatib ki, bədəndir; Atidəki söz qönçeyi-gülzari-dəhəndir.* M.Hadi.

**ATİL** *sif.* [*ər.*] Tənbəl, ətalətli, fəaliyyətsiz. *Atil adam. – Xatirindən sil o mövhumatı; Ki, edibdir səni tənbəl, atil.* A.Səhhət.

**ATİLLİK** *is.* Fəaliyyətsizlik, hərəkətsizlik, işsizlik, təşəbbüssüzlük; boş durma, tənbəllik, ətalət. *Atillik etmək.*

**ATQAYTARAN** *is. məh.* İri tikanlı ot, qanqal.

**ATQI** *is.* 1. Bir şeyin üzərindən atılan tir və s.

2. Toxuculuqda: ərişin üstünə gələn və məkiklə atılan arğac ipi.

3. Qadınlarda başa salınan şey, örpək və s.

4. *məh.* Taxılın yeməyə yaramayan hissəsi; tullantı.

5. *məh.* Şana, böyük yaba.

**ATQULAĞI** *zərf məh.* Qoşa, bir təndə, bərabər. *Əkinlər bir təndə, atqulağı qalxmışdı. – Anamın dediyinə görə biz atqulağı yaşıdıq.* Ə.Vəliyev.

**ATQULANCARI** *is. bot.* Bozumtul iri qulancar.

**ATLAMA** *is.* Su qatılaraq duru hala salınmış qatıq; ayran. *Yayın atlaması, qışın umacı.* (Ata. sözü).

**ATLAMAQ** *f.* 1. Aşmaq, aşıb keçmək, üstündən keçmək, keçmək. *Arxı adlamamış özünü öymə.* N.Vəzirov. [Şeyx Hadi:] *..Gəzdik az-çox Yəmən diyarində; Azacıq sonra atladıq Hində.* H.Cavid.

2. Buraxmaq, buraxıb keçmək. *Kitabı oxuyarkən iki sətir atladı.*

3. Keçmək, ötmək, aşmaq. [Cahan:] *..Mənim yaşım qırx beşdən atlayıb.* Ə.Haqverdiyev. *Gecə atlayıb keçmişdi, sabah günəşi xeyli qalxmışdı.* S.Rəhimov.

**ATLANBAC** *is.* Uşaqların bellərini əyərək bir-birinin dalından atılmaqla oynadıqları oyun.

**ATLANDIRMA** 1. "Atlandırmaq"dan *f.is.*

2. *is. etnoqr.* Kənd toylarında gəlini bəy evinə aparmaq üçün ata mindirdikdə və atlılar ata mindikdə zurna ilə çalınan havanın adı.

**ATLANDIRMAQ** *f.* 1. Ata mindirmək.

2. Atlı göndərmək.

**ATLANIŞ** *is.* Atlanmaq işi, atlanmaq üsulu.

**ATLANMAQ**[1] *f.* Ata minmək. [Mehtər:] *Mən bu dəqiqə gəlmişdim Heydərdən soruşam ki, cənabınız bu gün atlanacaqsınızmı?* M.F.Axundzadə. *Novruz cəld tüfəngini salır çiyninə, cilovu ağacın budağından çəkib, qaçır atlansın.* C.Məmmədquluzadə. *Sübh atlanıb, günortaya özümü Əhmədqalaya yetirdim.* Ə.Haqverdiyev. *Vaqif yenə Mirzə Əliməmmədlə atlanıb yola düşdü.* Çəmənzəminli.

**ATLANMAQ**[2] *f.* 1. Tullanmaq, sıçramaq, hoppanmaq. *Arxdan atlanmaq. Xəndəkdən atlanmaq. –Sənə elə bir meymun havası çalım ki, sıçrayıb dik atlanasan.* S.S.Axundov. // Bir şeyin üstündən atlanıb keçmək, aşmaq. *Bir ay yarım növbahardan keçəndə; Köysündən atlanır sellərin, dağlar!* Aşıq Ələsgər.

2. Döyünmək, çırpınmaq. [Hacı Murad:] *Gör ürəyim necə atlanır.* S.S.Axundov. *Dərs zamanı həmişə* [Sabirin] *ürəyi atlanırdı.* S.Rəhimov.

**ÁTLAS** [*yun.*] 1. Müəyyən sistem üzrə toplanmış xəritələr toplusu. *Coğrafiya atlası. Müasir atlasların banisi qədim yunan alimi Klavdi Ptolemey sayılır.*

2. Astronomik xəritə və cədvəllərdən, bədii şəkillərdən, texniki cizgilərdən, heyvan, bitki və s. şəkillərindən ibarət toplu. *Bitki atlası. Heyvanlar atlası. Anatomiya atlası. Azərbaycan dilinin dialektoloji atlası.*

**ATLAZ** *is.* [*ər.*] 1. Üzü hamar, parlaq ipək parça növü. *Get atlazın yaxşısından; Yaşılından da al gətir!* Aşıq Hüseyn. // Atlazdan tikilmiş. *Mən aşıq gül əndama; Çıxıbdır gülən dama; Olam bir atlaz köynək; Yaraşam gül əndama.* (Bayatı). *..Sürtükün bozarmış mahudu ilə şəvə kimi parlayan atlaz yaxalıq bir-birinə uymurdu.* M.S.Ordubadi. *Naznaz atlaz paltarını yığıb, neylon corablarda işıldayan qılçalarını qabağa verərək maşından çıxır.* M.İbrahimov.

2. Təşbihlərdə: atlaz kimi parlaq, hamar şey haqqında. *Doğrudan da, usta Ağabalanın saqqalı gözəl saqqal idi: qara atlaz parçası kimi üzünün iki tərəfini tutub.* Çəmənzəminli. *Ortada gömgöy otlarla atlaz kimi döşənmiş geniş bir meydan vardı.* M.Rzaquluzadə.

**ATLÉT** [*yun.*] *idm.* Atletika ilə məşğul olan idmançı.

**ATLÉTİK** *sif.* Atletikaya aid olan. *Atletik məşq. Atletik yarış.*

**ATLÉTİKA** *is.* [*yun.*] *idm.* Qüvvət və çeviklik tələb edən gimnastik hərəkətlər. *Yüngül atletika* (qaçış, hoppanma). *Ağır atletika* (güləşmə, boks, ağırlıq qaldırma). *Yüngül atletika yerimək, qaçmaq, tullanmaq və şey atmaq kimi hərəkətlərdən ibarət olub, idmanın ən çox yayılmış növlərindəndir.*

**ATLÉTİKAÇI** bax **atlet.** *Yarışlarda ölkəmizin ən güclü yüngül atletikaçıları iştirak edirdilər.*

**ATLI** 1. *sif.* At minmiş, süvari. *Atlı qoruqçu. Meşənin dalından bir neçə atlı əsgər göründü. – Rüxsarə başını qaldırıb atlı*

*adama baxdı.* S.Rəhimov. [Süleyman bəy:] *A kişi, gəzməyin elə bir ləzzəti piyada getməkdir, atlı* (z.) *gəzmək ləzzət verməz.* Ə.Haqverdiyev. // Atı olan. *Atlı kəndlilər.*

2. *is.* Ata minmiş adam. *Mənimlə onun arasında üç atlı vardı.* S.Hüseyn. *Kəblə İsrafil iki atlını evin dalında qoymuşdu ki, Bəndalı damı söküb .. qaçmasın.* Mir Cəlal. *Dərənin o biri tayında yoxuşun başında bir atlı dayanmışdı.* Ə.Məmmədxanlı.

**ATLIAĞAC** *is. məh.* Ağacla oynanılan uşaq oyunlarından birinin adı.

**ATLIQARIŞQA** *is.* Adi qarışqadan iri, ayaqları uzun, uzunsov və itigedən qarışqa növü.

**ATMA** "Atmaq"dan *f.is.* və *s. Atma nizə. Ən qədim insanların ilk atma silahı daş, ağac parçası və s. idi.*

**ATMACA** *is.* Birinə sataşmaq məqsədi ilə, yaxud zarafatla deyilən kinayəli söz. [Mindilli:] *Yusif, atmaca ilə danışma.* S.Rəhman. *Gülsənəmin atmacasından sonra heç kim dinmirdi.* M.Hüseyn. *Nərgizin atmacaları, Həbibin eyhamları səmərə vermədi.* Ə.Vəliyev. // Sif. mənasında. [Kərbəlayı Rəcəb:] *O zalım balası da həmişə mənim atmaca sözlərimi özgə cürə yozub.* N.Vəzirov. [Hətəm:] *Bu qızdan elə atmaca söz çıxır ki!* Mir Cəlal. ☐ **Atmaca atmaq** – kinayəli söz atmaq. *Adamların içində danışıq genişləndi, mübahisə şəklində yerdən atmacalar atıldı.* S.Rəhimov.

**ATMACALAMA** "Atmacalamaq"dan *f.is.*

**ATMACALAMAQ** *f.* Atmaca söyləmək, söz atmaq. *Monarxistlərdən daha mürtəce bir professor olmaq necə? – deyə Səlim dözə bilməyib atmacaladı.* M.Hüseyn.

**ATMACALI** *sif.* Atmaca mahiyyətində olan. *Atmacalı söz. Atmacalı-atmacalı* (z.) *danışmaq.*

**ATMAQ** *f.* 1. Bir şeyi əlindən buraxaraq yaxına, ya uzağa tullamaq, fırlatmaq. *Yol daşını yol quşuna; Atma, qardaş, kərəm eylə.* Xətayi. [Usta] *..əlindəki gül dəstəsini yemək masasının üstünə atdı.* M.Hüseyn. *Nisa kömür qabını yerə atıb gəldi.* Mir Cəlal.

2. Bir şeyi hündür yerdən aşağı tullamaq, salmaq. *Lövbəri dənizə atmaq. Damın qarını atmaq. – Kim isə zəncirləri lom ilə yerə atır.* M.İbrahimov.

3. Salmaq. *Həbsə atmaq. – Kərim xanı yenə .. bir qəbir təsiri bağışlayan kameraya atdılar.* M.İbrahimov. ☐ **Özünü atmaq** – atılmaq, tələsik girmək, keçmək, daxil olmaq. *İvaşenkonun geri oturtduğu düşmən dəstəsindən balaca bir qrup özünü keçidə atdı.* M.İbrahimov. *Uşaq özünü atasının qucağına atdı.* Mir Cəlal. *Mən güclə özümü oyankı otağa atdım.* S.Rəhman.

4. Tərk etmək, buraxmaq, üz döndərmək. *Ev-eşiyini atmaq. Arvad-uşağını atmaq. İşi atmaq. – Atdın vətəni neçin, qəribim? Arxandan əcəl məgər yetişdi?* A.Səhhət. // *məc.* Əl çəkmək, tullamaq, tərk etmək. *Papirosu atmaq. İçkini atmaq. – Səndən üzməmişəm bircə gün də əl; Demə: "Hüseyn məni atmış", amandır!* M.Rahim.

5. Rədd etmək, əməl etməmək. *Qardaşımın sözünü ata bilmədim.* M.S.Ordubadi.

6. Doldurulmuş tüfəngdən, tapançadan, topdan və s. silahdan atəş açmaq. *Tüfəng atmaq. Top atmaq. Pulemyot atmaq.*

7. *məc. dan.* Vurmaq, öldürmək, yaralamaq (tüfəng, ya tapança ilə). *Quş atmaq. – Nəbi hirslənib dedi: – ..bu saat burdan rədd olmasan, səni atacağam.* "Qaçaq Nəbi". *Ansızın çıxan bu ceyranı heç kəs ata bilmədi.* Çəmənzəminli.

8. Örtmək, salmaq, sərmək. *Üstünə yorğan atmaq.*

9. Səpmək. *Toxum atmaq.*

10. Sökülmək. [Hətəm] *əsəbilikdən yumruqları ilə ciblərini elə aşağı basdı ki, az qaldı paltarın tikişi atsın.* Mir Cəlal.

11. Döyünmək, vurmaq, tərpənmək. *Ürəyi atmaq. Nəbzi atmaq.*

12. Çıxarmaq, buraxmaq, pozmaq. *Məqalənin birinci abzasını atmaq.*

13. *məc.* Uzatmaq. *Bəzən adama elə gəlir ki, əlini dağların təpəsinə atsan, ulduzları tuta biləcəksən.* S.Rüstəm.

14. *məc. dan.* İçmək.

15. Bir sıra isimlərin yanına gətirilərək mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: can atmaq (b a x **can**), kif atmaq (b a x **kif**), əl atmaq (b a x **əl**), addım atmaq (b a x **addım**), püşk atmaq (b a x **püşk**).

**ATMİLÇƏYİ** *is. zool.* Atların qanını sormaqla qidalanan milçək növü.

**ATMİNƏN** *is.* Yaxşı at sürən adam, minici.

**ATMOSFÉR** [*yun.*] 1. Yer kürəsini və bəzi başqa planetləri, habelə Günəş və ulduzları bürüyən qazaoxşar təbəqə. *Günəşin şəffaf hissəsinə onun atmosferi, atmosferdən alt qata isə fotosfer deyilir.* – [Şahsuvarov:] *Mənə hər dəqiqə atmosferi öyrənmək lazımdır..* İ.Əfəndiyev.

2. Hava.

3. *fiz. tex.* Qazaoxşar maddələrin təzyiqini ölçmək üçün ölçü vahidi.

**ÁTOM** [*yun.*] 1. Kimyəvi elementin nüvədən və elektrondan ibarət ən kiçik hissəsi. *Atom enerjisi. Atom nüvəsinin radiusu təcrübədə ölçülə bilər. Atom kvant mexanikası qanunlarına tabe olan mikroskopik sistemdir. Atom bombası. Atom çəkisi.*

2. *məc*. Nəhayətsiz dərəcədə kiçik hissə, zərrə və ya kəmiyyət. [Qəhrəman:] *Doktor! Mən ruhun ən incə nöqtələrini deyil, bəlkə atomlarını belə hesaba alıram.* Ə.Vəliyev.

**ATOMÇU** *is*. və *sif.* 1. Atom sahəsində çalışan alim, mütəxəssis. *Atomçu alimlər atom silahının qadağan edilməsini tələb edirlər.*

2. Atom enerjisi və bombasından təcavüzkarlıq məqsədi ilə istifadə edilməsini tələb edən qatı imperialist.

**ATOMİSTİ́K** *sif.* Atomistikaya, atomizmə aid olan. *Atomistik nəzəriyyə.*

**ATOMİ́STİKA** [*yun.*] b a x **atomizm.** Atomistikanın əsas inkişaf mərhələləri.

**ATOMİ́ZM** [*yun.*] *fəls*. Materiyanın daim hərəkətdə olan əbədi, bölünməz və xırda zərrələrdən – atomlardan ibarət olduğunu iddia edən materialist nəzəriyyə (*bu nəzəriyyə ilk dəfə eramızdan qabaq VI əsrdə qədim hind filosofları və eramızdan qabaq V əsrdə yunan filosofları tərəfindən inkişaf etdirilmişdir*). *Levkipp, Demokrit, Epikur və Lukresinin fəlsəfəsində atomizm ardıcıl təlim kimi formalaşmışdır.*

**ATRİBÚT** [*lat.*] 1. Fəlsəfədə: hadisənin ayrılmaz, daimi, zəruri əlaməti, xassəsi. *Hərəkət materiyanın ayrılmaz atributudur. Bəziləri hətta təfəkkürü materiyanın atributu adlandırmışlar.*

2. Qrammatikada: təyin (cümlə üzvü).

**ATRİBUTİ́V** *sif. qram*. Atributa (2-ci mənada) aid, atribut mahiyyətində olan; təyini, təyin kimi işlənilən.

**ATRİBUTİVLİK** "Atributiv"dən *mücər.*

**ATROPİ́N** [*yun.*] Təbabətdə ağrıkəsən dərman və s. kimi işlənilən alkaloidlərdən biri. *Atropinin sulfat duzu məhlulu.*

**ATSİFƏT** *sif. dan.* Sifəti çox yekə və uzun. *Jandarmların yanında dayanmış qoca atsifət bir arvad .. bu qadınları axtarmağa başladı.* S.Rəhman.

**ATŞABALIDI** *is*. *bot.* Xarici görünüşcə şabalıd ağacına oxşayan bəzək bitkisi (ağac). *Atşabalıdının vətəni Cənubi Avropadır. Ağacları kürəyəbənzər çətir əmələ gətirir, boyu 15 m-dən hündür olur. Uzun saplaqlı yarpaqları qarşı-qarşıya düzülür və xarici görünüşcə çox gözəldir.* Axundzadə.

**ATTAŞÉ** [*fr.*] *dipl.* Bir ölkənin başqa ölkədəki diplomatik nümayəndəliyində müəyyən sahə üzrə mütəxəssis konsultant kimi çalışan diplomatik işçi. *Hərbi attaşe. Mətbuat attaşesi. Ticarət attaşesi.*

**ATTESTÁSİYA** [*lat.*] İşçinin bilik və bacarığını yoxlayan komissiyadan keçməsi. *İşçilərin attestasiyadan keçməsi tələb olunur.*

**ATTESTÁT** [*lat.*] 1. Orta məktəbi bitirmək və ya xidmət haqqında şəhadətnamə. *Mənim 20 yaşında olan oğlum Rəşid bəy Axundov 2 il bundan qabaq Tiflis klassik gimnaziyasının tam kursunu bitirərək, elmləri öyrənməsinə dair lazımi attestat almışdır.* M.F.Axundzadə.

2. Ezamiyyə və ya başqa yerə keçirildiyi zaman maaş almaq üçün hərbi xidmətçiyə verilən şəhadətnamə. // Hərbi xidmətçinin aylıq maaşının bir hissəsini almaq üçün onun ailə üzvünə verilən vəsiqə, şəhadətnamə.

**ATTRAKSİÓN** [*fr.*] Sirkdə, ya estradada tamaşa proqramının tamaşaçıların nəzərini ən çox cəlb edən hissəsi. // Mədəniyyət və istirahət parkında əyləncə.

**ATÜSTÜ** *sif.* və *zərf dan.* Başdansovma, tələsik görülən, necə gəldi, qeyri-ciddi, keyfiyyətsiz. *Atüstü iş. İşi atüstü görmək.* // Çox tələsik, ötəri. *Atüstü olsa da, qısa bir söhbət; Dönür unudulmaz bir xatirəyə.* S.Vurğun.

**AUDİTÓRİYA** [*lat.*] 1. Mühazirə, məruzə dinləmək, iclas, məşğələ və s. keçirmək üçün zal, otaq və s. *Tələbələr auditoriyaya doluşdular.*

2. Mühazirə, məruzə, nitq və sairə dinləyənlər. *Özünə auditoriya tapmış pəltək natiqlər kimi fürsətdən geniş istifadəyə çalışır.* Mir Cəlal.

**AUKSİÓN** [*lat.*] Müzayidə ilə satış; bir mülkün, malın və ya başqa bir şeyin açıq satışa qoyulması (belə satışda mal, mülk və ya şey, ona ən yuxarı qiymət verən adama çatır); hərrac. *Auksionun keçirilməsi vaxtı və yeri əvvəlcədən bildirilir.* – [Aydın:] *Auksionla canlı bir qız satılır, əli, ayağı, hətta ürəyi də var.* C.Cabbarlı.

**AUL** *is*. Dağıstanda, Mərkəzi Asiyada məskun məntəqə, kənd.

**AVADANLIQ** *is.* 1. Ev şeyləri, müxəlləfat, dir-dirrik. *Evinə avadanlıq almaq.*

2. Bir iş üçün lazım olan təchizat və ləvazimat; maşınlar, alətlər, cihazlar, mexanizmlər, qurğular və s. *Bəziləri hətta işdən kənar vaxtda elektrik stansiyası üçün müəyyən avadanlıq da qayırıblar.* M.Hüseyn. *Maşınqayırma sənayesi daha çox dərinliyi təmin edəcək mükəmməl qazıma avadanlığının istehsalını mənimsəməyə başlayır.* Quliyev.

**AVAM** *sif.* [*ər.*] Oxumamış, savadsız. *Avam adam.* – *Naçalnik Qurbanəli bəyə cavab verdi ki, Kərbəlayı Qasım qanmır, avamdı.* C.Məmmədquluzadə. [Tahir:] *Usta, məni o qədər də avam hesab etmə. Mən zəmanəmizin qədrini yaxşı bilirəm.* M.Hüseyn. // Sadədil, sadəlövh. *O çox avam adamdır.* // *İs. mənasında.* Geridə qalmış adam, savadsız adam. *Avamları başa salmaq.*

**AVAMCASINA** *zərf* Avam adam kimi, heç bir şeyi başa düşməyən adam kimi; cahilcəsinə. *Məşədi Kazım ağa .. avamcasına güldü.* M.S.Ordubadi.

**AVAMLIQ** *is.* Cahillik, cəhalət, savadsızlıq, mədəni gerilik, mədəniyyətsizlik. [Kor kişi] *tamamilə əski həyatın bir yadigarı idi. Əlbisəsinin tərzi, biçimi avamlığını .. andırırdı.* S.Hüseyn. // Sadəlik mənasında. [Səriyyə] *sadəliyindən, avamlığından hələ də başına gələn müsibəti tamamilə dərk edə bilmirdi.* M.İbrahimov.

**AVAMYANA** b a x **avamcasına.**

**AVAND** *is*. Bir şeyin, xüsusən, toxunmuş şeyin üst tərəfi, sığallı tərəfi; üz. *Bu parçanın astarı avandından yaxşıdır.* // Sif. mənasında. *Parçanın avand tərəfi.* – *Qiraətxananın ortasındakı uzun masanın üstü isə .. avandına* (z.) *bir-birinin üstünə tökülən qəzet, məcmuə və müxtəlif albomlarla dolu idi.* Ə.Əbülhəsən.

◊ **Avand olmaq, avanda düşmək** – uğurlu olmaq, müvəffəqiyyətli olmaq. [Məstəlişah:] *Məhzər oxuyuram, xanım, ki işimiz avand olsun.* M.F.Axundzadə. [Bədəl:] *İt itlə boğuşar, yolçunun işi avanda düşər.* Ə.Haqverdiyev. **İşin(iz) avand olsun!** – müvəffəqiyyət arzusu bildirən ifadə. [Səriyyə:] *Salam, bacılar, işiniz avand olsun!* M.İbrahimov.

**AVANDLAŞDIRMAQ** *f.* Yaxşılaşdırmaq, düzəltmək, sahmanlaşdırmaq, sahmana salmaq.

**AVANDLAŞMA** "Avandlaşmaq"dan *f.is.*

**AVANDLAŞMAQ** *f.* Yaxşılaşmaq, düzəlmək, sahmanlaşmaq, sahmana düşmək, qaydaya düşmək.

**AVANI** *sif. məh.* Ehtiyatlı, tədbirli. *Aslan bəy bir az avanı oğlandır, o, işini möhkəm aparıb, heç zad eyləyə bilməzsən.* N.Vəzirov.

**AVANQÁRD** [*fr.*] Ön dəstə, qabaqcıl dəstə; pişdar. // *məc.* Hər hansı bir ictimai qrupun, sinfin kütləni öz arxasınca aparan qabaqcıl hissəsi.

**AVANQARDLIQ** *is.* Qabaqcıllıq; rəhbərlik. *İşçi sinfinin avanqardlıq rolu.*

**AVÁNS** *is.* [*fr.*] Əvvəlcədən ödəmə, beh. *Avans almaq. Avans vermək.*

2. Müəyyən xərclər üçün qabaqcadan verilən pul. *Ezamiyyətə getmək üçün idarədən avans almaq. Avans almaq hüququ.*

**AVANTǗRA** [*fr.*] Təsadüfi müvəffəqiyyət ümidi ilə edilən şübhəli təşəbbüs, həqiqi qüvvə və şəraiti nəzərə almadan görülən iş; xətərli təşəbbüs, macəra. ..*Miss Hanna avantüranı sürətlə hiss edən, .. bərkə düşərsə özünü müdafiə etməyi bacaran bir qızdı.* M.S.Ordubadi.

**AVANTÜRAÇI** *is.* Macəraçı, macəra axtaran, avantüra düzəldən, fırıldaqçı.

**AVANTÜRAÇILIQ** *is.* Avantüraya meyil (b a x **avantüra**).

**AVANTÜRÍST** [*fr.*] b a x **avantüraçı.** *Rayon işçiləri çox Möhlətov kimi avantüristlərin maskasını yırtmışdır..* Mir Cəlal.

[Şahsuvarov:] *İnsan nə qədər avantürist olmalıdır ki, belə işlər tutsun.* İ.Əfəndiyev. [Çar] *hökuməti .. canilərin, qatillərin, julik və avantüristlərin, rüşvətxor və qaniçici parazitlərin yaramaz əməllərinə göz yumurdu.* H.Sarabski.

**AVANTÜRİ́ZM** [*fr.*] b a x **avantüraçılıq.**

**AVAR**[1] *is.* Qayığı sürmək üçün kürək, qayıqçı kürəyi. *Avar çəkmək. – Şamil bütün qüvvəti ilə avar çəkərək, qayığı gölün o biri sahilinə doğru sürürdü.* A.Şaiq. *Bədən tərbiyəsi hərəkətləri ilə, xüsusən idmanın üzmək, qaçmaq, ayaq xizəyində gəzmək və avar çəkmək kimi növləri ilə uzun müddət məşğul olmaq tənəffüs işini çox yaxşılaşdırır.* Babayev.

**AVAR**[2] *is. məh.* Keçmişdə kənd evlərinin damına döşənən qamışaoxşar ot; ümumiyyətlə, qaba quru ot.

**AVAR**[3] *is.* 1. Əsas kütləsi Dağıstanda yaşayan Qafqaz xalqlarından birinin adı və bu xalqa mənsub adam. *Avar dili Qafqaz dillərinin Dağıstan qoluna daxildir.*

2. *tar.* Qədim türkdilli tayfalardan birinin adı. *Macarıstan ərazisində avarlara aid xeyli abidə qalmışdır.*

**AVARA**[1] [*fars.*] 1. *is.* Heç bir işlə məşğul olmayaraq boş-boş gəzən adam, işsiz-gücsüz adam. *Burası xırda alverçilərin və bazar avaralarının dolandığı yer idi.* M.İbrahimov. // *sif.* İş bacarmayan, bir iş yiyəsi olmayan heç şeyə yaramayan. *..Qaraca qız da sərxoş və avara Yusifin hər bir əzabına dözür.* S.S.Axundov.

2. *sif.* Yersiz-yurdsuz, məskənsiz, sərsəri, sərgərdan. *Quduzluğun yayılmasının qarşısını almaqdan ötrü quduz və avara itləri məhv edirlər. – Avara itin hörməti olmaz.* (Ata. sözü). ◻ **Avara dolanmaq (gəzmək)** – işsiz, boş-bikar gəzmək, veyllənmək, tənbəllik edib heç bir işlə məşğul olmamaq. **Avara düşmək** – vətənindən, yurdundan məhrum olmaq, sərgərdan qalmaq. [Müsyö Jordan:] *Parij dağılıb, Tülyeri yıxılıb, Fransanın səltənəti pozulub, kral avara düşüb.* M.F.Axundzadə. **Avara etmək** – b a x **avara qoymaq (salmaq). Avara qalmaq** – əli hər şeydən çıxmaq, yerindən-yurdundan olmaq. **Avara qoymaq (salmaq)** – işdən-gücdən eləmək, məəttəl qoymaq, işindən ayırmaq; yerindən-yurdundan eləmək, evindən-eşiyindən ayırmaq, sərgərdan qoymaq. [Tükəz:] *Kişiciyi tovlayıb aparıb, avara saldınız.* M.F.Axundzadə. [Qonaqlar] *kişini işdən avara edib çağırdılar, bəhslərini söylədilər.* S.S.Axundov. *Bu baxışlar Nadiri dəli edib çöllərə salır və bir neçə günlük işdən avara qoyurdu.* B.Talıblı. **Avara olmaq** – b a x **avara qalmaq. Avara-sərgərdan düşmək** – b a x **avara düşmək. Avara-sərgərdan etmək** – b a x **avara etmək.** [Mirzə:] *Evi bərbad olmuş məni işimdən-gücümdən avara-sərgərdan eləyib gətirib buraya..* Ə.Haqverdiyev.

**avara-avara** *zərf* Veyil-veyil, boş-boşuna, heç bir işlə məşğul olmayaraq. *Avara-avara veyllənmək.*

**AVARA**[2] *is. məh.* Camış balası, ikiyaşar kəlçə.

**AVARAÇILIQ** b a x **avaralıq.** Avaraçılıqla gününü keçirmək.

**AVARALANMA** "Avaralanmaq"dan *f.is.*

**AVARALANMAQ** *f.* Avara-avara gəzmək, veyllənmək, xeyirli bir işlə məşğul olmamaq, vaxtını boş-boşuna keçirmək.

**AVARALAŞMA** "Avaralaşmaq"dan *f.is.*

**AVARALAŞMAQ** *f. dan.* 1. Avara olmaq; tənbəlləşmək, intizamsızlaşmaq, heç bir işlə məşğul olmamaq.

2. Xarab olmaq, korlanmaq, pisləşmək.

**AVARALIQ** *is.* 1. Heç bir işlə məşğul olmama, vaxtını boş-boş keçirmə; sərsərilik. *Bu oğlan avaralığa öyrənib, heç bir işdən yapışmaq istəmir.* ◻ **Avaralıq etmək** – heç bir işlə məşğul olmamaq, veyl-veyl gəzmək.

2. Özündən asılı olmayaraq işdən yapışa bilməmə, işdən ayrılma; məəttəlçilik.

**AVARÇƏKƏN** *is.* Qayıqda avar çəkməklə məşğul olan adam. *Avarçəkənlərin yarışı başa çatdı.*

**AVARÇI** *is.* b a x **avarçəkən.**

**AVARƏ** [*fars.*] b a x **avara**[1]**.** *Mişki-Çin avarə olmuşdur vətəndən mən kimi.* Füzuli. *Ey səba, yarə de ki, avarə gördüm Vaqifi.* M.P.Vaqif. *Doğru deyən olsaydı, yalançı*

*usanardı; Avarə qalanlar dəxi bir söz də qanardı.* M.Ə.Sabir.

**AVÁRİYA** *is.* [*ital.*] Qəza, nəqliyyat vasitələrinin toqquşması nəticəsində əzilərək sıradan çıxması. *Çətin işdə, avariya vaxtlarında bir də görərdin qapıda maşın səsləndi.* Mir Cəlal. *Avariyalar çox vaxt onların* [gənclərin] *diqqətsizliyi və təcrübəsizliyi üzündən olur.* M.Hüseyn. ◻ **Avariya maşını** – avariyaları düzəltmək üçün maşın.

**AVARLAMA** "Avarlamaq"dan *f.is.*

**AVARLAMAQ** *f.* Avar çəkmək.

**AVARLI** *sif.* Avarı olan, kürəyi olan, avarla hərəkətə gətirilən. *Avarlı qayıq.*

**AVAZ** *is.* [*fars.*] 1. Səs, səda. *Avazın yaxşı gəlir, oxuduğun Quran olsa.* (Ata. sözü). *Həkim özü yaxşıca avaz ilə oxuyurdu.* C.Məmmədquluzadə.

2. Hava, ahəng. *Aşıq Qərib sözün deyər avazla; Dindirəndə canım alar o, nazla.* "Aşıq Qərib". // Mahnı, nəğmə, xoş səs. *Avazın gələndə can bihuş olur; Qurbanam o nazik sədayə, Zeynəb!* M.P.Vaqif. *Ucalır göylərə elin avazı; Gülür bəxtsizlərin ömrünün yazı.* S.Rüstəm. *Qopdu dodaqlarından ürək açan bir avaz.* M.Müşfiq. ◻ **Avaz etmək** – hava ilə oxumaq. *Nazənin-nazənin edərsiz avaz; Ruhlar təzələnir, olur sərəfraz.* M.P.Vaqif.

**AVAZAT** *is.* [*fars.* "avaz" söz. cəmi] *mus.* Orta əsr Yaxın Şərq musiqi dəstgahlarında son altı pərdənin ibtidasını təşkil edən havacat silsiləsi. *Musiqi binasının möhkəm təməlini təşkil edən 12 sütun 12 əsas muğamı və 6 bürc isə 6 avazatı təmsil edirdi.* Ü.Hacıbəyov.

**AVAZƏ** *is.* [*fars.*] b a x **avaz**. *Ta əzəldən var mənim guşimdə eşq avazəsi.* Xətayi. *Nalədəndir ney kimi avazeyi-eşqim bülənd.* Füzuli.

**AVAZIMA** "Avazımaq"dan *f.is.*

**AVAZIMAQ** *f.* Rəngi qaçmaq, rəngi solmaq.

**AVAZIMIŞ** *f.sif.* Rəngi qaçmış, solmuş. *Cəlalzadə Dəmirovun avazımış sifətinə baxdı.* S.Rəhimov.

**AVAZLANMA** *is.* Tələffüz tərzi, səsin tonu, yüksəlib-enməsi; intonasiya.

**AVAZLAŞMA** "Avazlaşmaq"dan *f.is.*

**AVAZLAŞMAQ** *qarş.* Səs-səsə vermək, bir yerdə oxumaq.

**AVAZLI** *sif.* Səsi olan; gözəl səsli, xoş səsli. *Naz eləyən nazlı dilbər; Qumru tək avazlı dilbər; Salla yana siyah zülfü.* Miskin Əli.

**AVAZSIZ** *zərf* Ahəngsiz, adi səslə, hava ilə olmayaraq. *Qənbər başını salır aşağı və bir də avazsız həmin sözləri deyir.* C.Məmmədquluzadə.

**AVDUĞ** b a x **abduq.**

**AVESTA** *is.* Qədim, əfsanəvi peyğəmbər Zərdüştə isnad edilən müqəddəs kitablar külliyyatı. *Avestanın yazıldığı dili bəzən Midiya dili adlandırırlar. Ərəb işğalları dövründə və sonralar Sasanilər dövrü Avestasının xeyli hissəsi məhv olmuşdu.*

**AVIRTMAC** *is. məh.* Un ilə yağdan bişirilən bir xörək.

**avia...** [*lat.*] Mürəkkəb sözlərin əvvəlində aviasiya mənasını ifadə edir, həmin sözlərin aviasiyaya aid olduğunu göstərir; məs.: aviabomba, aviabaza, aviatexnik və i.a.

**AVİÁSİYA** [*fr.*] Hava nəqliyyatının hamısı, hava donanması. *Mülki aviasiya. Hərbi aviasiya. Aviasiya bayramı. Aviasiya texnikasının inkişafı.*

**AVİASİYAÇI** *is.* Hava nəqliyyatı işçisi, hava donanması xidmətçisi. *Aviasiyaçılar hərbi dənizçilərin təliminə həsr edilmiş montajlar və stendlər düzəldirlər.*

**AVİÁTOR** [*fr.*] Hava donanmasında təyyarəçi.

**AVİTAMİNÓZ** [*xar.*] *tib.* Qidada vitaminlərin olmaması və ya azlığı nəticəsində əmələ gələn xəstəlik; vitamin çatışmazlığı. *Tibbi praktikada bəzən təkcə bir vitaminin deyil, bir çox vitaminlərin çatışmazlığına və bunların nəticəsində əmələ gələn mürəkkəb avitaminoz xəstəliyinə təsadüf edilir.* Əliyev.

**AVİZƏ¹** *is.* [*fars.*] *köhn.* Çilçıraq, qəndil. *Tavandan asılan avizənin hər birisi dar ağacından asılan bir vücud kimi donub dururdu.* M.S.Ordubadi.

**AVİZƏ²** *is.* [*fars.*] *köhn.* Sırğa.

**AVİZƏLİ** *sif.* Qəndilli, çilçıraqlı, qəndil asılmış. [Əbülhəsən bəy:] *Biz balkonla avizəli və böyük lampalarla işıqlanmış otaqların qabağından keçərək gedirdik.* M.S.Ordubadi.

**AVÍZO** [*ital.*] *mal.* Qarşılıqlı bank hesablaşmalardakı dəyişikliklər haqqında göndərilən bildiriş vərəqəsi.

**ÁVQUST** [*lat.*] Təqvim ilinin səkkizinci ayı. *Avqust ayı Roma imperatoru Avqust şərəfinə adlandırılmışdır.*

**ÁVRAL** [*ing.*] 1. Gəmidə bütün komandanın iştirakı ilə görülən iş. *Artıq avraldan çox nadir hallarda istifadə edilir.*

2. *məc.* Növbədənkənar və çox təcili bir işi və ya tapşırığı yerinə yetirmək üçün bütün işçilərin səfərbər edilməsi. *Adamlar buraya avrala yox, daimi işə gəliblər.* Ə.Sadıq.

**AVRALÇILIQ** *is.* Ciddi bir işin çox tələsik, başdansovma, eyni zamanda patıltı-gurultu ilə görülməsi (yalnız mənfi mənada işlənir). *İşdə avralçılıq və özbaşına axın məhsulun həm keyfiyyətinə, həm də kəmiyyətinə çox pis təsir edir.*

**AVRÓPASENTRİZM** *is.* Elmin, incəsənətin, fəlsəfənin, ədəbiyyatın və s. həqiqi sərvətlərin, zənginliklərin inkişafını yalnız Avropada görən konsepsiya. *Avropasentrizmin mənbələri. Avropasentrizm ideyaları. Qabaqcıl mütəfəkkirlər avropasentrizmə mənfi yanaşma.*

**AVSTRALİYALI** *is.* Avstraliya qitəsi əhalisinə mənsub adam.

**AVSTRALOPİTEK** *is.* [*lat.*] Qazıntı zamanı tapılmış insanabənzər meymun (artıq nəsli kəsilmişdir). *Avstralopiteklərin qalıqları.*

**AVSTRİYALI** *is.* Avstriyanın əsas əhalisinə mənsub adam.

**AVŞAR** *is. məh.* Şəlalə, şır-şır, şırran.

**AVŞARLAMAQ** *f. məh.* Südün hamısını sağmaq üçün heyvanın yelinini ovuşdurmaq, sıxmaq.

**ÁVTO** [*fr.*] Avtomobil. *Uzanmış şəhərin polad əlləri; Qatarlar, avtolar gəlir Muğana.* S.Vurğun. *Avto müfəttişi yoxdur ki, Ağabalanı tanımasın.* Mir Cəlal.

**avto...** [*yun.*] Mürəkkəb sözlərin birinci tərkib hissəsi olub, aşağıdakı mənaları ifadə edir: a) avtomobil sözünün ixtisarı, məs.: avtomaşın; b) avtomatik sözünün ixtisarı; özü işləyən, özü hərəkət edən, məs.: avtoxizək; c) özü, özünün, məs.: avtobioqrafiya.

**AVTOBİOQRAFÍK** *sif.* Bir şəxsin öz həyatına, tərcümeyi-halına aid olan. *Avtobioqrafik əsər.*

**AVTOBİOQRÁFİYA** [*yun.*] Bir şəxsin özü tərəfindən yazılmış tərcümeyi-halı.

**AVTÓBUS** [*alm.*] Çoxyerli minik avtomobili. *Avtobus saf havaları yara-yara meşələrə bürünmüş böyük dərələri dolandıraraq, bizi öz yerimizə gətirdi.* M.Hüseyn.

**AVTODÜKAN** *is.* [*yun.* avto və dükan] Avtomobildə düzəldilmiş səyyar dükan. *Həftəbaşı Xınalığa gələn avtodükan yeni-yeni mallar gətirir.* R.Rza.

**AVTOGÉN** [*yun.*]: **avtogen qaynaq** *tex.* – iki metal parçasını çox yüksək qaz hərarəti təsiri ilə əridib bir-birinə yapışdırma üsulu.

**AVTOGENÇİ** *is. xüs.* Metalları avtogen üsulu ilə işləyən fəhlə.

**AVTOXİZƏK** *is.* [*yun.* avto və xizək] Qar üstündə hərəkət edən, qabaq təkərlərinin altında xizəkləri olan xüsusi quruluşlu avtomobil.

**AVTOQƏLƏM** *is.* [*yun.* avto və qələm] Mürəkkəbi avtomatik surətdə peroya axan qələm.

**AVTÓQRAF** [*yun.*] 1. Bir müəllifin özü tərəfindən yazılmış əlyazması. *Görkəmli şəxsiyyətlərin avtoqrafı mötəbər sənəd kimi saxlanılır.*

2. Bir şəxsin öz xətti ilə imzası, xatirə qeydi. *Avtoqraf vermək.*

3. *tex.* Surətçıxaran cihaz növü.

**AVTOQRÁFİYA** [*yun.*] 1. Bir xəttin, rəsmin, cizginin eyni ilə çıxarılmış surəti.

2. *xüs.* Litoqrafiyada çap olunacaq orijinalı hazırlama üsullarından biri.

**AVTÓL** [*lat.*] *kim. tex.* Avtomobillər, traktorlar və bir sıra başqa maşınlar üçün neftdən hazırlanan sürtkü yağı.

**AVTOMAŞIN** [*yun.* avto və *fr.* maşın] Avtomobil. *Yollarda və küçələrdə avtomaşınların səsi aramsız surətdə eşidilməkdədir. – İyulun birinci yarısında məclis iclas etdiyi zaman bir avtomaşın .. siqnal verməyə başlayır.* M.İbrahimov.

**AVTOMÁT** [*yun.*] 1. *sif.* Daxilindəki mexanizm vasitəsilə öz-özünə hərəkət edən, öz-özünə işləyən; avtomatik. *Avtomat tormoz. Avtomat telefon. Avtomat silah. – Məmmədrza avtomat tüfəngini dilləndirən kimi pulemyotlar susdu.* Mir Cəlal. *Toxuculuq kombinatında köhnəlmiş toxucu dəzgahla-*

*rının avtomat dəzgahlarla dəyişdirilməsi işi başa çatdırılmışdır.*

2. *is.* Avtomatik işləyən mexanizm, maşın və s. *1926-cı ildə mühəndis Skvorsovun qazma avtomatı tətbiq edilir. Avtomat o zaman qazılan quyuların əyilməsi ilə mübarizə üçün gözəl bir vasitə idi.* Quliyev.

3. *is.* Daxilindəki mexanizm vasitəsilə durmadan güllə atan tüfəng. *Pulemyot və avtomat atəşləri isə şiddətindən qalmırdı.* Mir Cəlal. *Soldat nə isə qışqıraraq avtomatını qaldırdı, onun* [Ulduzun] *sinəsindən vurub geri itələdi.* Ə.Məmmədxanlı.

**AVTOMATÇI** *is.* 1. Avtomatla silahlanmış əsgər və s. *Avtomatçı dəstəsi. – Nərimanı bir avtomatçının qabağına qatdılar.* Mir Cəlal.

2. *xüs.* Avtomat dəzgahında və s.-də işləyən fəhlə.

**AVTOMATİ́K** *sif.* 1. Öz-özünə işləyən, işi insanın köməyi olmadan görən. *Avtomatik silah. Avtomatik idarəetmə.*

2. *məc.* Qeyri-iradi, qeyri-şüuri. *Avtomatik hərəkət.*

3. *Zərf mənasında.* Avtomatik surətdə. *Tramvayın qapıları avtomatik açılıb-örtülür.*

**AVTOMÁTİKA** [*yun.*] İnsanı bilavasitə istehsal prosesində iştirakdan azad etmək üçün tətbiq edilən texniki vasitələrin və üsulların məcmusu. *Elm kimi avtomatika avtomatik tənzimləmə nəzəriyyəsi əsasında yaranmışdır.*

**AVTOMATİKLİK** *is.* Hərəkətin qeyri-iradiliyi, orqanizmin iradə və şüurun iştirakı olmadan hərəkət etməsi xassəsi. *Tamamilə aydındır ki, heyvanlarda, hətta daha artıq inkişaf etmiş heyvanlarda belə yalnız hərəkətlərin avtomatikliyi mövcuddur.* Hacıyev.

**AVTOMATİ́ZM** [*yun.*] b a x **avtomatiklik**.

**AVTOMATLAŞDIRILMA** "Avtomatlaşdırılmaq"dan *f.is.* İdarəetmə işlərinin avtomatlaşdırılması. *Fabrikdə bir sıra istehsal proseslərinin mexanikləşdirilməsi və avtomatlaşdırılması nəzərdə tutulmuşdur.*

**AVTOMATLAŞDIRILMAQ** *məch.* Avtomatlar tətbiq edilmək. *Universal rentgen ekranlarının işləməsi avtomatlaşdırılmışdır.*

**AVTOMATLAŞDIRILMIŞ** "Avtomatlaşdırılmaq"dan *f.sif. Avtomatlaşdırılmış zavodda beton hazırlanacaq, hazır beton isə konveyerlərlə tikinti sahəsinə veriləcəkdir.*

**AVTOMATLAŞDIRMA** "Avtomatlaşdırmaq"dan *f.is. Tamaşaçılar filmlər nümayiş etdirilməzdən əvvəl, avtomatlaşdırma sahəsində çalışan mütəxəssislərin mühazirələrini dinləyirlər.* (Qəzetlərdən).

**AVTOMATLAŞDIRMAQ** *f.* 1. İstehsal prosesində avtomatlar tətbiq etmək. *Bu proses .. istehsalatı mexanikləşdirmək və avtomatlaşdırmaq yolu ilə həyata keçirilir.* (Qəzetlərdən).

2. İnsanın hərəkətlərini şüurilikdən çıxarıb qeyri-şüuri hərəkətə çevirmək (konveyerdə işlədikdə və s.).

**AVTOMOBİ́L** [*lat.*] Torpaq, asvalt və daş yollarda adam və yük daşıyan motorlu nəqliyyat vasitəsi. *Yük avtomobili. Minik avtomobili. Avtomobil nəqliyyatı. Sükan avtomobilin hərəkətinə istiqamət verir.*

**AVTOMOBİLÇİ** *is.* 1. Avtomobil işi mütəxəssisi.

2. Avtomobil idmanı ilə məşğul olan adam. *Avtomobilçilərin yarışı.*

**AVTOMÜFƏTTİŞ** [*yun.* avto və *ər.* müfəttiş] Avtomobil nəqliyyatı hərəkətinə və işinə nəzarət edən şəxs. *Avtomüfəttiş Tahirin qabağını kəsdi.* M.Hüseyn.

**AVTOPORTRÉT** [*yun.* avto və *fr.* portret] Rəssamın özü tərəfindən çəkilmiş şəkli. *Avtoportretin ən mükəmməl nümunələrini Rembrandt yaratmışdır.*

**AVTOREFERÁT** [*yun.* avto və *lat.* refero] Bir elmi əsərin müəllifin özü tərəfindən yazılmış xülasəsi. *Doktorluq dissertasiyasının avtoreferatı.*

**AVTORİTÉT** [*alm.*] 1. Nüfuz, etibar, səlahiyyət. *Avtoritet qazanmaq. Avtoritetdən düşmək.*

2. Nüfuzlu adam. *Kimya sahəsində böyük avtoritet. – Qəbiristanda qulyabanı olmaz, xortdandır, – deyə başqa bir uşaq da söhbətə girişərək, bilən adamlar kimi böyük avtoritetlə* (z.) *izahat verdi.* B.Talıblı. [Cahangiri] *ancaq Atayev kimi böyük bir avtoritet öz yerində oturda bilərdi.* İ.Əfəndiyev.

**AVTORİTETLİ** *sif.* Nüfuzlu, səlahiyyətli, kütlə içərisində nüfuzu, etibarı, hörməti olan; sözükeçən. *Avtoritetli müdir.*

**AVTORİTETSİZ** *sif.* Nüfuzsuz, etibarsız, kütlə içərisində hörməti, etimadı olmayan.

**AVTORİTETSİZLİK** *is.* Nüfuzsuzluq, etibarsızlıq, kütlə içərisində hörməti, etimadı olmama.

**AVTOSİSTÉRN** [*yun.* avto və *lat.* sistern] Mayeləri daşımaq üçün sisterni olan xüsusi qurğulu avtomobil. *Neft məhsulları, süd, pivə, maye qaz, kimyəvi aktiv maddələr, sement və undaşıyan avtosistern var.*

**AVTOVAĞZAL** *is.* Şəhərlərarası və şəhərətrafı avtobus marşrutları sərnişinlərinə xidmət göstərmək üçün şəhərlərdə yaradılan tikililər kompleksi.

**AY[1]** *is.* 1. Yer kürəsinin peyki olub, onunla birlikdə Günəşin ətrafında fırlanan və gecələr inikas edən Günəş işığı ilə işıqlanan göy cismi. *Ay işığı. Ayın batması. – ..Ay buludlar arasından siyrilib çıxdı.* M.Hüseyn. // *məc.* Gözəlin camalına təşbih (bəzən ay üz, ay parçası, on dörd gecəlik ay və s. tərkiblərdə işlənir). *Ay üzünü görmək istər sevdiyim; Söylə görüm bəs yaşınmaq nədəndir?* Qurbani. *Heyran görüncə ay camalın; Oldu genə eşqdə fəsanə.* Heyran xanım. ☐ **Ay doğmaq** – ay çıxmaq. *Əzizim, aydın olsun; Ay doğsun, aydın olsun; İki həsrət qovuşdu; Gözlərin aydın olsun.* (Bayatı). [Faytonçu:] *İnşallah, gecə yarısı, ay doğanda yola düşərik*. Ə.Haqverdiyev. **Ay görünmək** – hər ayın əvvəlində hilalın (ayparanın) ilk dəfə görünməsi. **Ay qalxmaq (qəlbilənmək)** – ucalmaq, yüksəlmək, üfüqdən uzaqlaşmaq (Ay). **Ay qaranlığı** – aysız gecə, Ay işığı olmayan gecə, qaranlıq gecə. **Ay qaranlıqlamaq** – axşamdan görünməyib gecədən bir qədər keçəndən sonra, ya səhərə yaxın görünmək (Ay). **Ay parçası** – 1) hilal, aypara; 2) *məc.* gözəlin epitetlərindən biri. **Ay tutulmaq** *astr.* – Yer kürəsinin Günəş ilə Ay arasına girməsi nəticəsində Ayın müvəqqəti olaraq qismən və ya tamamilə görünməməsi. *Bəzən şəhərə belə bir səs düşərdi ki, gün və ya ay tutulmuşdur.* H.Sarabski. **Boz ay** – qışın axırıncı ayı, mart ayı. *Artıq Qarabağ düzənliyinin boz ayı başlamışdı*. S.Rəhimov. **Elqovan ay** – yayın axırıncı ayı, yaylaqdan qayıtma vaxtı.

2. İlin bölündüyü on iki hissədən hər biri. *Yaz ayları. Bir ay bundam əvvəl. İlimiz on iki aydır. – Zakira, səbr elə ki, vəslə deyən afətdən; Ay ötər, il dolanar, vaxt olu, hicranə dəyər.* Q.Zakir. [Ayrım qızı] *Kərim babanı qızışdırmaq fikri ilə deyirdi: – Bu yaramazı görürsünüzmü? Aylarca* (z.) *üzünü görməzdim.* A.Şaiq. *Gün keçir, ay ötür, il yaman gedir.* M.Rahim. ☐ **Ayda-ildə** – hərdən, hərdənbir, gec-gec, nüdrətən. *Ayda-ildə bir namaz, onu da şeytan qoymaz.* (Ata. sözü). *Araz başdan lil gələr; Dəstə-dəstə gül gələr; Neylərəm belə yarı; Ayda-ildə bir gələr.* (Bayatı).

**AY[2]** *nida*. 1. Çağırış, müraciət, haylama, haraylama nidası. *Ay camaat! – Ay qalan uşaqlar, siz bizim dalımızda olun, qorxmayın*! M.F.Axundzadə. [Kərbəlayı Fatma:] *Ay hacı, bu nə xəbərdir? Deyirlər Kərbəlayı Fətulla dirilib gəlir?* C.Məmmədquluzadə. *Növbət gəlinə gəldi: – Ay uşaq, qaçın, gəlin gəlsin*. Çəmənzəminli. // Bəzən təsiri şiddətləndirmək üçün “haray”, “dad” sözləri ilə birlikdə deyilir: [Nazir:] *Ay haray, ay dad, a başına dönüm! Axır mənim təqsirim nədir!* M.F.Axundzadə.

2. Gözlənilməyən bir keyfiyyət, ya hadisə nəticəsində doğan hissi, qorxunu, diksinmə və s. hissləri ifadə edir. *Ay, ilana bax! Ay, gələn odur! Ay, qorxdum ki! Ay, ürəyim qopdu!* // Kədər, təəssüf, mərhəmət, şəfqət kimi hissləri ifadə edir. *Ay yazıq! Ay biçarə! – Əxlaqi pozğun, adəti pis, pasibanı yox; Qəlbim yanar, ona deyərəm: “Ay yazıq çocuq!”* A.Səhhət. // Birdən ağrı tutduqda deyilir. *Ay başım! Ay öldüm!* // Təəccüb, heyrət, heyranlıq ifadə edir. *Ay, nə çoxdur! Ay, nə gözəldir!* // Təsiri gücləndirmək üçün deyilir (bəzən təkrar edilməklə: ay, ay, ay). *Ay, ay, ay! Nə gözəl səs gəlir!* // Narazılıq, məmnunsuzluq və s. ifadə edən xitab bildirir. *Boşla, ay molla dayı, sən də bizi çəkmə zora; Biz sənin hiylən ilə düşmərik əsla bu tora.* M.Ə.Sabir. *Ay Mirzə Səttar, axır niyə insaf ilə danışmayırsan?* Ə.Haqverdiyev. [Zəhra:] *Ay Kərim, çox öyünmə. Ayrım qızı dörd-beş kişiyə dov gəldi.* A.Şaiq.

3. “A” yerində nida olaraq işlənir (b a x **A[2]**). *Ay uşaqlar, bir sakit olun! Ay yoldaş, səbr elə! Ay qız! Ay qoçaq!*

**AY[3]** *is. astr.* İlin on iki hissəsindən biri. 8-i 31, 4-ü 30, 1-i 28 (hər dörd ildən bir 29) gündən ibarətdir.

**ÁYA** *əd.* Sual və təəccüb ilə bərabər təmənna və ümid bildirir; görəsən. *Aya bu işdən bir şey çıxacaq? Aya bir az tez gələ bilməzdin? – Hər xilqətə gərçi bir səbəb var; Aya səbəbi kim etdi izhar?* Füzuli. [Nuxalılar:] *Aya biz bu gün o cənabın ziyarətinə müşərrəf ola bilərikmi?* M.F.Axundzadə. *Hamı məəttəl qalıb, aya bu qədər yandüdüyünü haradan yığmaq mümkündür və aya görəsən qoşuna bu qədər yandüdüyü nə lazımdır?* C.Məmmədquluzadə.

**AYÁ** *is.* 1. Barmaqlar daxil olmadan əlin içi, açıq yeri.

2. Yarpağın üzü. [Gülxətminin] *yarpaqları dar xaçvaridir, aya və qın hissəsi də tüklərlə örtülüdür.* H.Qədirov.

**AYAĞIAĞIR** b a x **ağırayaq**.

**AYAĞIPƏRDƏLİ** *sif. zool.* Suda üzmək üçün barmaqlarının arası bir-birinə dəri pərdə ilə bitişik olan. *Ayağıpərdəli quşlar* (qaz, ördək, anqut və s.).

**AYAĞISÜRÜŞKƏN** *sif. dan.* Əxlaqı yüngül, pozğun (qadın haqqında).

**AYAĞIYÜNGÜL** b a x **ayağı yüngül** (**"ayaq¹"**də).

**AYAĞIYÜNGÜLLÜK** *is.* Xoşqədəmlik.

**AYAQ¹** *is.* 1. İnsan və heyvanın yeriməsinə xidmət edən bədən üzvü. *Balaca ayaq. Qarın üstündə heyvan ayağının izi var. Ayaq barmaqları. – Təkərlərin səsi, atların ayaqlarının tappıltısı meşələrə səs salırdı.* N.Nərimanov. *Fərraşlar Məşədi Həsəni yıxıb ayağına on çubuq vurdular.* Çəmənzəminli. // Qıç mənasında. *Ayaq getdi, əl gətirdi, diş yedi; Baxmaqdan savayı gözə nə qaldı?!* Aşıq Alı.

2. *dan.* Yarım arşına yaxın məsafə ölçüsü. *Üç ayaq aralığı var. Stolların arası beş ayaqdır.*

3. Sürət, addım mənasında. *Yolda Məmməd bəy Səfərə dedi: – Səfər, qoşun ayağı ilə getsək, gec olacaq, Mustafa xan kəndləri çalıb-çapıb qaçacaq, gəl çaparaq gedək.* Çəmənzəminli.

4. Bir sıra şeylərin ayağa oxşayan, yerə dirənən hissəsi, dayağı, qıçı, dirəyi. *Masanın ayağı. Taxtın ayaqları. Çarpayının bir ayağı sınmışdır.* // Dik duran şeylərin yerə dirənən alt hissəsi. *Nərdivanın ayağı. Sütunun ayağı. – Qədim dayı axşama kimi pillənin ayağında oturdu.* S.Rəhimov.

5. Çay, bulaq və s. axar suların aşağı hissəsi. *Çay ayağı. Arxın ayağı gölə tökülür.*

6. Son, axır. *Onun sözünün nə başı var, nə ayağı. – Pambıq, ərzaq və xuşgəbar karvanının başı, ayağı məlum olmayırdı.* Ə.Haqverdiyev. // Bir yerin qurtaracağı, son nöqtəsi. *Kəndin ayağından bir bulaq axır; Toz qalxızmış suya gələn mal-naxır.* A.Səhhət. *Sağ tərəfimizdə Azadlıq kəndinin meşəsinin ayağı gərək olsun.* T.Ş.Simurq.

7. *dan.* Dəfə, kərə. *Bir ayaq. Maşın hər ayaqda üç ton yük aparır. Avtobus səhərdən beş ayaq gəlib-getmişdir. – ..Beş ayaq qayıtdıqları halda, yeddi dəfə xörəyi doldurub boşaldırdılar.* Ə.Vəliyev. ☐ **Bu ayaq** – indi, bu dəfə. [Koroğlu:] *Aşıq Cünun, indi de görüm, haraları gəzdin? Nə gördün? Nə eşitdin? Bu ayaq haradan gəlirsən?* "Koroğlu".

8. *məc. dan.* Dəyərsiz, alçaq, qiymətsiz, keyfiyyətsiz, keyfiyyətcə yaramaz. *Ayaq mal.*

9. Tüfəng, tapança kimi silahların çaxmağı, tətiyi. *Tüfəngi ayağa çəkmək. Tapançanın ayağı boşdur. Qoşalülənin ayağı işləmir.* ☐ **Ayaqda qoymaq** – tüfəng, ya tapançanın çaxmağını geri çəkərək atmaq üçün hazır saxlamaq.

10. Adətən çıxışlıq halında: **ayaqdan, ayağından** *dan.* – hesabdan, ...hesabından. *Qoyunu qoyun ayağından, keçini keçi ayağından.* (Məsəl). [Məşədi:] *Çitin arşınını bir şahıdan, .. ay-ulduzu iki abbasıdan, məxməri on şahıdan və qalan malı da bu ayaqdan qiymət edirlər.* Ə.Haqverdiyev.

11. Adətən yerlik halında: **ayağında** *dan.* – vaxtında, məqamında, çağında, zamanı olduğu halda, baş verdikdə. *Dava ayağında yardıma gəlmək.*

◊ **Ayağa atılmaq** – birdən qalxmaq. *Özünü yuxuya verən Sərvinaz xanım ayağa atılıb, qapını möhkəm bağladı.* S.Rəhimov. **Ayağa bağlanmaq** – əngəl olmaq, əl-qol açmağa mane olmaq. **Ayağa çıxmaq** – qurtarmaq, bitirmək, tamam etmək. **Ayağa dolaşmaq** – mane olmaq, əngəl olmaq. **Ayağa döşənmək** – çox yalvarmaq. **Ayağa durmaq** – b a x **ayağına qalxmaq (dur-**

**maq)**. **Ayağa düşmək** – 1) b a x **ayağa döşənmək**. *Cananı görən ləhzədə can düşdü ayağa; Yalvardı gəda iczilə sultanını görcək.* S.Ə.Şirvani; 2) ucuzlaşmaq. *Malın qiyməti lap ayağa düşdü;* 3) hörmətdən düşmək. **Ayağa qaldırmaq** *məc.* – 1) hərəkətə gətirmək, həyəcana gətirmək. *Xalqı da ayağa qaldıran və* [inqilab] *ətrafına toplayan bugünkü qurbanlar olacaqdır.* M.S.Ordubadi. *Sarıl günəş rəngli bir al bayrağa; Səsinlə elləri qaldır ayağa.* S.Vurğun; 2) sağaltmaq. *İstisu vannaları bir həftədən sonra xəstəni ayağa qaldırdı;* 3) bəsləyib-böyütmək, tərbiyələndirmək, yetişdirmək, araya çıxartmaq, müstəqil hala gətirmək. **Ayağa qalxmaq** – 1) hərəkətə gəlmək, qiyam etmək, üsyan etmək. *Asiya və Afrika xalqları ayağa qalxaraq öz istiqlaliyyətləri uğrunda mübarizə aparırdılar. – Vyetnam, Malay da qalxmış ayağa; Gülür azadlığın bayrağı Çində!* Z.Xəlil; 2) xəstəlikdən sağalmaq, durmaq, yaxşı olmaq; 3) işləri qaydaya düşmək, düzəlmək, artıq müstəqil olmaq. *İndi uşaqlar böyüyüb, hamısı ayağa qalxıbdır.* **Ayağa salmaq** – qiymətdən salmaq, hörmətdən salmaq, etibardan salmaq, gözdən salmaq. *Ayağa salıbdır Vaqifi qəmlər; Baş çəkəydi binəvayə, gələydi.* M.P.Vaqif. *Yüz feyzin olsa xəlqə əgər afitabtək; Dövran salar ayağa səni mahtabtək.* S.Ə.Şirvani. [Məsum kişi:] *Harda yazılıb ki, oğul atanı .. ayağa salsın.* Mir Cəlal. **Ayağa vermək** – tərəfini vermək, alçaltmaq, hörmətdən salmaq. **Ayağı açılmaq** – 1) bir yerə gedib-gəlməyə başlamaq; 2) ishala düşmək, qarnı işləmək. **Ayağı ağır** – b a x **ağırayaq**. **Ayağı bağlı olmaq** – qəbiz olmaq, qarnı işləməmək. **Ayağı dolaşmaq** – büdrəmək, gəzərkən çaşmaq. **Ayağı düşmək** – 1) guya birinin gəlməsi xoşbəxtliyə, müvəffəqiyyətə, işin baş tutmasına səbəb olmaq; ayağı xeyirli olmaq, xoşqədəm olmaq. *Xala, məni təbrik et. Qızın ayağı mənə düşdü.* A.Şaiq; 2) təsadüfən, yaxud keçərkən bir yerə gəlmək. *Mənim qapıma ayağın düşər, səni it ilə çıxardaram.* Ə.Haqverdiyev. **Ayağı işləmək** – b a x **ayağı açılmaq** 2-ci mənada. **Ayağı kəsilmək** – 1) bir yerə gəlib-getməmək, əlaqəsini kəsmək. *Dövlət getdi, hörmət qalxdı aradan; Qapımızdan dost ayağı kəsildi.* Aşıq Ələsgər; 2) ardı kəsilmək, daha gəlməmək. **Ayağı sürüşmək** *məc.* – səhv etmək, düz yoldan çıxmaq, yanılmaq. **Ayağı uğurlu** – b a x **ayağı yüngül. Ayağı yanmaq** *məc.* – vurulmaq, bənd olmaq. [Şəhrəbanı xanım:] *Şahbaz bəy Qarabağda oturduğu yerdə, Parij qızlarına ayağı yanıb, Müsyö Jordana qoşulub getdi.* M.F.Axundzadə. **Ayağı yer almaq** – yeri möhkəmlənmək, dili uzun olmaq, özünə güvənmək. [Çiçək xanım:] *Mən səndən yavaş danışıram, yoxsa ayağın yer alır?* N.Vəzirov. **Ayağı yer tutan** – gəzə bilən, yeriməyə iqtidarı olan. *Nəhayət, qocaların məsləhəti ilə Xınalıqda qalmış bütün kolxozçular, ayağı yer tutan qocalar, arvadlar, uşaqlar mücü yığmaq üçün dağdərəyə dağılmışdılar.* R.Rza. **Ayağı yüngül** – ayağı xeyirli, uğurlu, xoşqədəm. **Ayağına aparmaq** – hesab etmək, bir sırada tutmaq. [Əziz bəy:] *Buyur, Səkinə xanımın özü ilə də küftgu edə bilərsən! Onu özgə qızlar ayağına aparma!* M.F.Axundzadə. **Ayağına çağırmaq** – yanına gəlməsini əmr etmək. **Ayağına düşmək (döşənmək)** – birinin qabağında diz çökərək yalvarmaq. *Əgər ayağına düşmək macalım olsaydı; Dəxi götürməz idim baş anın ayağından.* Nəsimi. *Seyyid, görəndə yarı düşürsən ayağına.* S.Ə.Şirvani. *Dolanıb başına sərvi-rəvanın; Döşən ayağına qaşı kəmanın.* Q.Zakir. **Ayağına getmək** – minnət götürmək, xahiş etmək. **Ayağına gəlmək** – 1) təslim olmaq, razılığını bildirmək üçün birisinin hüzuruna gəlmək; 2) hörmət və ehtiram üçün birinin qulluğuna getmək. **Ayağına qalxmaq (durmaq)** – biri daxil olarkən hörmət üçün ayağa qalxmaq. *Bütün ailə onun ayağına qalxdı, yuxarı başa keçirdilər*. Mir Cəlal. **Ayağına yazmaq** – 1) birinin hesabına yazmaq; 2) birisinə isnad etmək. **Ayağına yıxılmaq** – bax **ayağına düşmək (döşənmək).** [Ələsgər ağanı] *görcək,* [Usta Ağabalanın] *cəmi dərd yadından çıxdı. Onun ayağına yıxılıb sevindiyindən ağladı.* Çəmənzəminli. **Ayağında qalmaq** – borcu qalmaq. **Aya-**

**ğından çəkmək** – birini yıxmağa çalışmaq, ayağının altını qazımaq; birinin qeybətini etmək, ziddinə getmək. *Mən rədd etdim, o pərt oldu, tez ayağımdan çəkdi.* S.Rüstəm. [Həpir:] *Taleyim belədir, xalqın yeddi arxa yadları ağzını açanda tərif tökür, .. mənim .. doğma atam ayağımdan çəkir.* Mir Cəlal. **Ayağını açmaq** – işlətmək, ishala salmaq. *Çiy süd uşağın ayağını açdı.* **Ayağını basmamaq** – b a x **ayaq basmamaq**. *Sevil gedəndən bəri* [Gülüş] *ayağını bu evə basmayıb.* C.Cabbarlı. **Ayağını başından aşırmaq** – öldürmək. *O, ilk atəşi ilə düşmən zabitinin ayağını başından aşırdı.* Mir Cəlal. **Ayağını çəkmək** – 1) axsamaq; 2) tərk etmək, əlaqəni, gediş-gəlişi kəsmək, bir yerə daha gedib-gəlməmək. **Ayağını kəsmək** – 1) bir yerə daha gedib-gəlməmək, əlaqəni kəsmək. *Seyyid, qayıt bu mərhələdən, kəs ayağını; Axır bu rahi-meykədənin bir məlalı yox.* S.Ə.Şirvani. *Pərzad bir müddət ayağını qızının evindən kəsdi.* Mir Cəlal; 2) gedib-gəlməsinə icazə verməmək, əlaqəni kəsməyə məcbur etmək, səbəb olmaq. *Doktor bir saniyə düşündükdən sonra: – Mən onun ayağını buradan kəsərəm, – dedi.* A.Şaiq; 3) aradan qaldırmaq. [Xanqulu:] *..İndi şikayət yoxdur, koxa! Nədən ki, bu oğurluğun ayağını kəsibdir.* S.Rəhimov. **Ayağını qarmaq** *məc.* – qorxutmaq, hədələmək, döymək. **Ayağının altına dəmir (ərsin) at(ın)!** – gəlməsi arzu edilən və çoxdan görünməyən bir adam bir yerə birinci dəfə, ya da çox uzun müddət keçdikdən sonra gəldikdə, yaxud bir adam gəlmədiyi bir yerə birinci dəfə gəldikdə deyilir. [Hacı Ağadadaş:] *Əleykəssalam, həmişə sən gələsən, a balam, bunun ayağının altına bir dəmir atın!* H.Sarabski. **Ayağının altını qazımaq** – birinə zərər vermək, pislik eləmək üçün onun əleyhinə xəlvəti iş görmək. [Babacan:] *Bu gün çörəyimi yeyən adam sabah ayağımın altını qazır.* Ə.Əbülhəsən. **Ayağının altını öpmək** – birinin qabağında alçalaraq yalvarmaq, özünü son dərəcə alçaltmaq. **Ayaq açmaq** – bir yerə tez-tez gəlmək. **Ayaq almaq** – tələsmək, tez-tez getmək, cəld yerimək, iti getmək, qaçmaq. **Ayaq altına almaq** – məğlub eləmək, tamamilə özünə tabe etmək. **Ayaq altına düşmək** – tapdalanmaq. *Turac təki ayaq altına düşdüm; Hər yetən tapdalar, şəhrə yol oldum.* Aşıq Cuma. **Ayaq altına salmaq** – hörmətdən, nüfuzdan, qiymətdən salmaq. **Ayaq altında qalmaq** – tapdalanmaq, təzyiq altında olmaq. **Ayaq basmaq** – bir yerə girmək, daxil olmaq, gəlmək. *Pişxidmətlər əllərində məcməyi ilə ki içində xələti-şahanə qoyulmuşdu, dükana ayaq basdılar.* M.F.Axundzadə. [Ülfət:] *Görürsən, yad qızı hələ evə ayaq basmamış, gədənin saqqızını oğurlayıb.* Mir Cəlal. **Ayaq basmamaq** – bir yerə daha gedib-gəlməmək, əlaqəsini kəsmək, girməmək. [Hacı Kərim:] *Sizə demişəm, mənim otağıma ayaq basmayın.* A.Şaiq. **Ayaq çalmaq** – b a x **ayaq döymək**. **Ayaq çəkmək** – b a x **ayaq kəsmək**. *Ayaq çək, Zakira, bəsdir, bəqasız dəhr bağından; Nə gördün dərdü möhnətdən savayı bir səmər ondan.* Q.Zakir. *Qüdrət heç vaxt evimizdən ayaq çəkmirdi.* M.S.Ordubadi. **Ayaq dirəmək** – inad etmək, israr etmək, tərslik etmək, dediyindən əl çəkməmək. **Ayaq döymək** – bir şeyi əldə etmək üçün çox çalışmaq, gedib-gəlmək, əlləşmək, işləmək. *Ramazan özü də belə bir ustanın yanında on beş il ayaq döymüş, yalnız inqilabdan iki ay sonra buruq ustası ola bilmişdi.* M.Hüseyn. **Ayaq götürmək** – tez yerimək, iri addımlarla yerimək. *Xalamın yalvarmağı yadıma düşəndə bir qədər ayaq götürdüm.* C.Məmmədquluzadə. **Ayaq izi** – ləpir. **Ayaq kəsilmək** – gediş-gəliş dayanmaq, sakitlik düşmək. [Qüdrət] *evinə çatanda hələ küçələrdən ayaq kəsilməmişdi.* M.Hüseyn. **Ayaq kəsmək** – b a x **ayağını kəsmək** 1-ci mənada. *Söhbəti-əhli-riyadan qət edib kəsdim ayaq.* S.Ə.Şirvani. **Ayaq qoymaq** – b a x **ayaq basmaq.** *Axır sən də bir hərəkət eylə, bir proqresə ayaq qoy.* M.F.Axundzadə. *Elə ki, ikinci aya ayaq qoydu, dinməz-söyləməz övrəti çağır yanına, dur bir dəfə də olsun alnından öp.* C.Məmmədquluzadə. **Ayaq olmaq** – şərik olmaq, ortaq olmaq, bir işə qoşulmaq, bir işdə iştirak etmək. *Sən də oyunda bizimlə ayaq ol.*

**Ayaq saxlamaq** – dayanmaq, durmaq. *Kəndlilər ayaq saxladılar.* Ə.Haqverdiyev. *Yolçu çarəsiz qalıb ayaq saxladı.* Ə.Məmmədxanlı. **Ayaq sürmək** – birinin üstünə hücum çəkib getmək. *Üstümə ayaq sürüb gəldi*. **Ayaq sürümək** – könülsüz yerimək, yubanmaq, geri qalmaq, gedərkən qəsdən dala qalmaq. **Ayaq tutmaq** – 1) təzə-təzə yeriməyə başlamaq. [Tapdıq] *təzə-təzə ayaq tutub yeriyəndə qalxıb .. özünü birdən-birə cəhrənin arxasında oturan anasının qucağına atardı.* Ə.Əbülhəsən; 2) ayaqlaşmaq, bərabər olmaq. *O, bu işdə mənimlə ayaq tuta bilməz;* 3) vagirlik etmək (b a x **vagirlik**). *Bəzən bir böyük qazmada .. Səlim meyxana deyər, o biriləri ayaq tutardılar.* Ə.Əbülhəsən. **Ayaq üstə dura bilməmək** – 1) çox zəif, taqətsiz, əldən düşmüş adam, ya heyvan haqqında; 2) çox sərxoş adam haqqında. *O qədər içib ki, ayaq üstə dura bilmir.* **Ayaq üstə qalmaq** – oturmağa yer tapmamaq. **Ayaq vurmaq** – 1) həddindən artıq yerimək, gəzmək, bir şeyi əldə etmək üçün çox gəzmək; 2) nişanı düz vurmamaq, hədəfin alt yanına vurmaq. *Tüfəng ayaq vurur*. **Ayaqda qalmaq** – 1) b a x **ayaq üstə qalmaq**; 2) axıra qalmaq, geridə qalmaq. **Ayaqda sürünmək** – hamıdan geriyə qalmaq. **Ayaqdan (ayağı) diri** – bir işi tez gedib yerinə yetirən, iti gedən, cəld yeriyən adam haqqında. **Ayaqdan düşmək (olmaq)** – yeriməkdən yorulmaq, taqətdən düşmək, üzülmək. *Düşər ayaqdan ol sərv qamətin, billah; Qiyaməti gətirər başıma əyan, getmə!* X.Natəvan. *Yardən xali görüb bəzmi ayaqdan düşdüm; Saqiya, tut əlimi bir dolu peymanə ilə.* S.Ə.Şirvani. **Ayaqdan salmaq** – 1) çox gəzdirib yormaq, əldən salmaq. *Uşağı lap ayaqdan saldın*; 2) üzmək, iztirab vermək, cəfa və əziyyət vermək. *Saldı məni ayaqdan qəm, ver piyalə, saqi; Yoxdur bir ondan özgə üftadələr dayaqi*. Q.Zakir. *Ayrılıq dərdi məni ayaqdan saldı, yarım.* Heyran xanım. *Saldı ayaqdan aşiqi, ey yar, firqətin; Gəl bir əyadətə əgər olsa fəraqətin*. M.Ə.Möcüz; 3) bir yeri çox gəzmək. *Şəhəri ayaqdan salmaq*. **Ayaqdan-dırnaqdan düşmək** – b a x **ayaqdan düşmək (olmaq)**. **Ayaqları ardınca sürünmək** – son dərəcə yorularaq zorla yerimək, yeriyə bilməmək. *Bu gün o qədər gəzmişəm ki, ayaqlarım ardımca sürünür.* **Ayaqlarını uzatmaq** *məc.* – ölmək. **Bərk ayağa çəkmək** – sıxışdırmaq, ciddi imtahana çəkmək. **Bərk ayaqda** – iş çətinə düşdükdə, vəziyyət çox çətin və ağır olduqda, təhlükə zamanı. *Bərk ayaqda yoldaşı tərk etmək olmaz. – Hər iki xalqdan olan zəhmətkeş camaat dostluğu pozmur, kəsdikləri duz-çörəyi tapdalamır, bərk ayaqda da həmişə birlik yaradırdılar.* Çəmənzəminli. **Bir ayağı getmək, bir ayağı getməmək** – tərəddüd etmək, nə edəcəyini bilməmək. [Uşaq] *atasından cavab almadığından, bir ayağı gedər, bir ayağı getməzdi*. H.Sarabski. **Bir ayağı qəbirdə** – b a x **qəbir**. *Arvadı Nabat xalanı, qoca, bir ayağı burda, bir ayağı qəbirdə olduğu üçün, Əhməd onu varislər arasına daxil etməyirdi*. B.Talıblı. **Əl-ayağa düşmək** – b a x **əl**. **Əl-ayağı soyumaq** – b a x **əl**. **Əl-ayaq çəkilmək** – b a x **əl**. **Əlini-ayağını çəkmək** – b a x **əl**. **İki ayağını bir başmağa dirəmək (soxmaq)** – tərslik etmək, inadla tələb etmək, israr etmək, inadla istəmək, bərkə salmaq, darıxdırmaq. **(Öz) ayağı ilə gəlmək** – təsadüfən gəlmək, dəvətsiz, çağırılmadan, öz xoşu ilə gəlmək. **Öz ayağı ilə tələyə düşmək** – öz təqsiri üzündən özünü kələyə salmaq, öz işini çətinliyə salmaq, özünü çıxılmaz, çətin vəziyyətə salmaq. **Üstünə ayaq almaq – b a x ayaqlanmaq** 3-cü mənada. *Biri gedib Ballıca yolunu kəsib, gəlib-gedənə sataşır, biri də qaçaqlıq eşqinə düşüb üstümüzə ayaq alıb...* Çəmənzəminli. *Bədirnisə Badam xalaya yavaşca deyirdi: – Dərnəyə yazıl getsin, bütün arvadlar gəlir.. Yazılmasan tay-tuş üstünə ayaq alar*. Mir Cəlal. *Dərə-təpə, it-qurd üstümüzə ayaq alacaq.* S.Rəhimov.

**ayaq-ayaq** *zərf* Bir ayaq-bir ayaq, addım-addım, yavaş-yavaş, ağır-ağır. *Ayaq-ayaq nərdivana çıxarlar.* (Ata. sözü).

**AYAQ**[2] *is. klas.* Qədəh, piyalə. *Meygərçi səfa verər damağə; Axdığı üçün düşər ayağə.* Füzuli. *Ta girib meyxanə içrə başıma çəkdim ayaq*. S.Ə.Şirvani.

**AYAQAÇDI**, **AYAQAÇMA** *is. etnoqr.* Qızın toydan sonra atası evinə birinci dəfə gəlməsi adəti. *Məşədi öz qızını və kürəkənini .. axşam çörəyinə ayaqaçmaya çağırmışdı.* Ə.Haqverdiyev.

**AYAQALTI** *is.* 1. Ayaq altına salınan, yaxud ayaq silmək üçün qapının ağzında, girəcəyində salınan xalça, balaca palaz, həsir, əsgi və s. // Dar, uzun xalça. *Ayaqaltı salınmış pilləkən.*

2. Daim tapdalanan, daim hamının basıb keçdiyi yer. *Həyət lap ayaqaltı oldu.*

3. *məc.* Heç kəsin saymadığı, hesablaşmadığı, hörmət etmədiyi adam; iradəsiz, həqir, məzlum adam. □ **Ayaqaltı olmaq** – öz iradəsizliyi, yaxud acizliyi üzündən hörmətdən düşmək, heç kəs tərəfindən sayılmamaq, hamının təhqirinə məruz qalmaq.

**AYAQ-AYAĞA** *zərf* 1. Bir vaxtda, birdən, o biriləri ilə bir vaxtda ayağını qoyub götürərək; bərabər, birlikdə. *Uşaqlar ayaq-ayağa yeriyirlər.*

2. *məc.* Öz hərəkət və görüşünü uzlaşdıraraq, uyğunlaşdıraraq. *Zəmanə ilə ayaq-ayağa getmək.*

**AYAQCIQ** *is.* 1."Ayaq"dan *kiç. Quşun ayaqcığı.*

2. *bot.* Çiçək və meyvənin saplaqcığı.

**AYAQÇI**[1] *is. məh.* 1. *köhn.* Qapı-qapı gəzib, mal satan adam; çərçi.

2. Kağızpaylayan, kuryer.

**AYAQÇI**[2] *is. qəd.* Keçmişdə: qədəh gəzdirən, şərab paylayan; saqi. *Cam içirən ayaqçıya döndü Füzuli; Şairlərə bir içim mey sundu Füzuli.* Ə.Cavad.

**AYAQDAŞI** b a x **dabandaşı**. *Hamamçının qabağında .. xırda bankaların içində rüşul, ayaqdaşı, xına, yumurta və bu kimi şeylər olardı.* H.Sarabski.

**AYAQDUZAĞI** *is.* 1. Ayaq buxovu.

2. *məc.* Əngəl, maneə.

**AYAQKİRƏSİ** *is. köhn. dan.* Getmək və gəzməklə əlaqədar olan bir iş üçün tələb olunan zəhmət haqqı.

**AYAQQABI** *is.* Ayağa geyilən şey. *Dəri ayaqqabı. Rezin ayaqqabı. Ayaqqabı mağazası. Ayaqqabı fabriki.*

**AYAQQABIÇI** *is.* Çəkməçi, ayaqqabı tikən, ya yamayan usta.

**AYAQLAMA** "Ayaqlamaq"dan *f.is.*

**AYAQLAMAQ** *f.* 1. Tapdalamaq, tapdalayıb əzmək, ayaqları altında əzmək, ayağı ilə məhv etmək, xarab etmək. *Əkini ayaqlamaq. Güllüyü ayaqlamaq. Otu ayaqlamaq.* // Məc. mənada. *Avropanı ayaqlayıb gələn düşmən hələ bu cür inadlı müqavimətə rast gəlməmişdi.* Ə.Əbülhəsən. // Ayaqla basmaq, sıxmaq, əzmək. *Palçığı ayaqlamaq. Torpağı ayaqlamaq.* // Ayaqla vurmaq, əzişdirmək, ayaqları altına salıb döymək. [Hacı Mədinə:] *Səni bu küçədə yıxıb o qədər ayaqlaram ki, beynin torpağa qarışar.* C.Məmmədquluzadə.

2. Gəzmək, dolaşmaq. *Bütün şəhəri ayaqladım.*

3. *məc.* Saymamaq, tapdalamaq, pozmaq. *Mən deyirəm: "Qoy var olsun sinəmdəki el ürəyi; Mərd oğullar ayaqlamaz and içdiyi duz-çörəyi".* S.Vurğun. *Əkbər istədi işi, aclığı və hətta canından əziz tutduğu sevgilisini belə ayaqlayıb keçsin..* Mir Cəlal.

4. *məc.* Sıxmaq, təzyiq altına almaq, mənəvi əzab vermək. *Fəsli-bahar gəldi, könül, künci-bağ tut; Möhnət səni ayaqladı, bir dəm ayaq tut.* Q.Zakir.

**AYAQLANDIRMA** "Ayaqlandırmaq"dan *f.is.*

**AYAQLANDIRMAQ** *f.* Üzərinə qaldırmaq, təhrik etmək, cəsarətləndirmək.

**AYAQLANMA** "Ayaqlanmaq"dan *f.is.*

**AYAQLANMAQ** 1. *məch.* Tapdalanmaq, tapdalanıb əzilmək, ayaq altında əzilmək, məhv edilmək, xarab edilmək. // Ayaqla basılmaq, sıxılmaq; ayaqla vurulmaq, əzişdirilmək, ayaq altına salınıb döyülmək.

2. *t-siz.* Ayağa qalxmaq, yerimək. *Meşələrin içində, dağların arasında yerləşən balaca obalar sanki yerindən tərpənib ayaqlanmışdı.* S.Rəhimov.

3. *t-li. məc.* Birisinin üzərinə hücum etmək, qalxışmaq, təcavüzə başlamaq. *Nə üçün onun üstünə belə ayaqlanırsan? – Mən dayanıb dursam bir az; Ayaqlanar qarı düşmən.* S.Vurğun.

**AYAQLAŞMA** "Ayaqlaşmaq"dan *f.is.*

**AYAQLAŞMAQ** *f.* 1. Biri ilə ayaq-ayağa gedə bilmək, bərabər getmək, birgə yerimək. *Bizi müşayiət edən küçə adamları faytonla ayaqlaşıb bərabər gedə bilərdilər.*

M.S.Ordubadi. [Səlim] *atı yavaş-yavaş sürdü ki, Abbas kişi ayaqlaşa bilsin.* Mir Cəlal. *Mən Eldarla ayaqlaşmaqda çətinlik çəkirdimsə də, utandığımdan dinməyib ardınca qaçırdım.* İ.Əfəndiyev.

2. *məc*. Özünü birinə çatdırmağa, oxşatmağa çalışmaq; yarışmaq. *Uşaq anası və bacısı ilə ayaqlaşmağa çalışır, onlara əlavə yük olmaq istəmirdi.* M.İbrahimov. *Kənddə ruh, iradə və qoçaqlıqda bu cavanlarla ayaqlaşan və onlardan geri qalmayan igid qocalar da az deyildir.* Ə.Sadıq.

3. *məc*. Uyğunlaşmaq, günün tələbinə cavab vermək. *Yazıçılar günün tələbi ilə ayaqlaşmalıdırlar.*

**AYAQLATMAQ** *icb*. Tapdalatmaq, ayaq altında əzdirmək, xarab etdirmək. *Əkini malqaraya ayaqlatmaq.*

**AYAQLI** *sif.* 1. Ayağı olan (b a x **ayaq**[1] 4-cü mənada). *Ayaqlı şkaf. Ayaqlı paltarasan.*

2. *məc*. Zirək, cəld, çevik, ayaqdan cəld. ☐ **Ayaqlı tərpənmək** – cəld tərpənmək, tez hərəkət etmək. *Qoca bənna səsləyirdi bir gənc fəhləni; Tez ol, oğul! Daş qurtardı, ayaqlı tərpən!* Ə.Cəmil.

**AYAQLIQ** *is*. 1. Dikinə duran və ya qoyulan şeylərin dayanacağı. *Nərdivanın ayaqlığı. Heykəlin ayaqlığı. Sütunun ayaqlığı.*

2. Ayaqqabının üzü. *Tuflinin ayaqlığı yırtılmışdır. Qaloşun ayaqlığı. Səndəlin ayaqlığı.*

3. *məh.* Pilləkən, nərdivan.

**AYAQSEYRİ** *is. dan.* Əylənmək və ya istirahət üçün yaxın yerlərə ayaqla səyahət. *Ayaqseyrinə çıxmaq.*

**AYAQSIZ** *sif.* Ayağı olmayan, qıçsız. *Ayaqsız adam. Ayaqsız taxt. – Oraq onun* [quşun] *hər iki ayağını biçmiş, o kiçik heyvan ayaqsız* (z.) *qalmışdı.* A.Şaiq.

**AYAQÜSTÜ** 1. *zərf* Tələsik, oturmadan, ötəri, ayaq üstündə. *Ayaqüstü yemək. Ayaqüstü işləmək. Ayaqüstü xəstəyə baş çəkdim.* – [Rüstəm kişi] *..işdən xəbərdar olmaq üçün .. ayaqüstü Kələntər lələşə baş çəkməyi qərara aldı.* M.İbrahimov.

2. *is*. Məclisdə, qonaqlıqda və s.-də ayaqüstülük edən adam. *Məclisin ayaqüstüsü.*

**AYAQÜSTÜLÜK** *is*. Məclisdə, qonaqlıqda və s.-də qonaqlara xidmət etmə. *Ayaqüstülük etmək.*

**AYAQYALIN** *sif.* 1. Yalınayaq, ayağı çılpaq, ayağında heç bir şey olmayan. *Ayaqyalın uşaqlar qara düşüb, çil toyuğu basmarlayıb tutdular*. S.Rəhimov. // Zərf mənasında. *Ayaqyalın gəzmək. – Laçın ..* [uşaqların] *hər ikisinin dalınca baxdı, ayaqyalın olduqlarını gördü.* M.Hüseyn. *Sitarə ərini yuxuya verib otaqdan çıxdı və bir dəqiqə çəkmədi ki, küçədən ayaqyalın və başıaçıq qaçmağa üz qoydu.* Çəmənzəminli. [Uşaq] *ev sahibinin qabağından qalan tör-töküntünü yeyərdi. Qışın soyuğunda ayaqyalın su daşıyardı.* H.Sarabski.

2. *sif. məc.* Lüt, yoxsul, heç bir şeyi olmayan. ☐ **Ayaqyalın qalmaq** – lüt qalmaq, hər şeyi əlindən çıxmaq, var-yoxu əlindən getmək. **Ayaqyalın qoymaq** – var-yoxunu əlindən almaq, lüt qoymaq.

**AYAQYERİ** *is.* 1. Quyuya düşmək üçün divarlarında ayaq keçirməkdən ötrü açılan oyuq.

2. Faytonda, karetdə və s.-də minmək üçün düzəldilmiş ayaq yeri.

**AYAQYOLU** *is.* Təbii ehtiyacları rəf etmək üçün yer; abdəstxana, rahatxana.

◊ **Ayaqyoluna düşmək** – ishala düşmək, qarnı işləmək.

**AYALAMA** *məh.* b a x **ayalqa**.

**AYALQA** *məh.* b a x **ayama.**

**AYAMA** *is*. Bir adama el tərəfindən verilən ləqəb, ad. *Sadıq bir az duruxub cavab verdi ki, "lağlağı" onun ayamasıdır.* C.Məmmədquluzadə.

**AYAR** *is. dan.* 1. Barama, pambıq və s. bu kimi xam mallardan əldə edilən xalis malın miqdarı.

2. B a x **əyyar**.

**ÁYAT** *is.* [*ər.* "ayə" söz. cəmi] b a x **ayə**[1] 1-ci mənada. *Ya ki, bir molla olub soymağa məxluqatı; Xahişi-nəfslə şərh eylər idi ayatı.* A.Səhhət.

**AYAZ** *is.* Qışda buludsuz, aydın gecələrdə quru soyuq, şaxta; ümumiyyətlə, bərk soyuq. *Qış yolunu yaz kəsdi; Qaranı bəyaz kəsdi; Gecə durdum qapıda; Əllərim ayaz kəsdi.* (Bayatı). *Gül rəngli havada toz, duman var; Dəhşətli soyuq, ayaz, boran var.* A.Şaiq. *Gecələr ayazda, gündüzlər al gün*

*altında gəmi muzdurunun zəhməti hər bir zəhmətdən fövqdür.* S.M.Qənizadə.

**AYAZIMA** "Ayazımaq"dan *f.is.*

**AYAZIMAQ** *f.* 1. Göy üzü açılmaq, buluddan, dumandan təmizlənmək, aydınlaşmaq. *Bir az qabaq hava buludlu idi, indi ayazıyıbdır. – Payızın çiskinli, dumanlı günü ayazıyırdı.* S.Rəhimov. *Duman bir qədər ayazıdı, döyüşçülərə yol açdı.* Ə.Vəliyev. *Yağış bu saat kəsəcək, yuxarı ayazıyır.* İ.Əfəndiyev.

2. Gecə ayazında bərk üşümək, soyuqdan donmaq.

3. *məc.* Ağır xəstəlikdən ayılmaq, bir az yaxşılaşmaq, xəstəliyi yüngülləşmək, rəngi özünə gəlmək, bənizi açılmaq. *Xəstə dünənkinə nisbətən bir az ayazıyıbdır.* // *məc.* Açılmaq. [Nəbinin] *buludlu qaşqabağı birdən ayazıyıb açıldı.* S.Rəhimov. // *məc.* Ayılmaq, özünə gəlmək. *Zabitlə soldatlar hələ dünənki içkidən ayazımamış, həyatla vidalaşmalı oldular.* M.Hüseyn. *Bulanıq və dərin yuxulardan ayazıyıb, özümə gəldim.* Mir Cəlal.

**AYAZITMAQ** *f.* Ayaza vermək, şaxtaya vermək, soyutmaq, dondurmaq.

**AYAZLAMA** "Ayazlamaq"dan *f.is.*

**AYAZLAMAQ** b a x **ayazımaq** 1 və 2-ci mənalarda.

**AYAZLI** *sif.* Şaxtalı, soyuq. *Sən ayazlı gecələrdə ulduzların sirdaşısan; Boranların, çovğunların, dumanların qardaşısan.* S.Vurğun.

**AYAZLIQ** *is.* 1. Buludsuz, aydın, eyni zamanda da soyuq gecə, ya gündüz.

2. *məh.* At çulunun içinə astar kimi tikilən keçə.

**AYBAAY** *zərf* Müntəzəm surətdə hər ay, aydan-aya. *Aybaay hesabat vermək. Üzvlük haqqını aybaay toplamaq. Aybaay geri gedir.*

**AY-BALIQ** *is. zool.* Tropik dənizlərdə yaşayan girdəsifət balıq. *Ay-balıq ən çox kürü tökən balıqdır.*

**AYBAŞI** *is.* 1. Həddi-büluğa çatmış qızlarda, həmçinin qadınlarda vaxtaşırı (hər ay) uşaqlıqdan qan ifrazı; adət, heyz. *Aybaşı orta beyindəki cinsiyyət mərkəzləri ilə tənzim olunur.*

2. Ürəkkeçmə.

**AYBƏNİZ** *sif. şair.* Sifəti ağ, gözəl, göyçək.

**AYDIN** *sif.* 1. İşıqlı, aylı, mahtab. *Aydın gecə. – Azər daha çox zövq alır aydın gecələrdən.* H.Cavid. *Aydın bir gecədir, ulduzlar həsrətlə yerə baxır.* S.Rüstəm.

2. İşıqlı, nurlu, işıqsaçan. // Parlaq.

3. Buludsuz, açıq, təmiz. *Aydın səma. Aydın hava. – Çiskinli və qaranlıq gecəni aydın bir səhər əvəz etdi.* M.İbrahimov. ◻ **Aydın olmaq** – aydınlaşmaq, açılmaq, buluddan, çəndən təmizlənmək. *Yağış nə qədər gurultulu yağsa, o qədər sonra hava xoş və aydın olur.* A.Divanbəyoğlu. *Mən aşiq aydın olsun; Ay doğsun, aydın olsun..* (Bayatı). // *məc.* Təmiz, saf, ləkəsiz, sakit. *Aydın baxışlar. Aydın gözlər. – Tahir Lətifənin aydın baxışlarındakı səmimiyyətə qətiyyən şübhə etmirdi.* M.Hüseyn.

4. Heç bir şübhə doğurmayan, aşkar, açıq, bəlli, məlum, şübhəsiz. *Aydın məsələ. Fikrimiz aydındır.*

5. Yaxşı başa düşülən, seçilən, qavranılan, eşidilən, görünən. *Aydın səs. Dağların aydın görünən zirvələri. – Aydın vəzndə olan musiqiyə xalq mahnıları, müxtəlif xalq rəqs havaları, habelə "təsnif"lər* (*vokal musiqisi*) *və "rəng"lər* (*çalğı musiqisi*) *daxildir.* Ü.Hacıbəyov. *Aydın məqsəd olmadan işə başlamaq yaramaz.* Ə.Sadıq. ◻ **Aydın etmək** – aydınlaşdırmaq, aşkar etmək, bəlli etmək, müəyyənləşdirmək. *Məsələni aydın etmək lazımdır. Vəziyyəti aydın etmədən heç bir söz demək olmaz.* **Aydın olmaq** – 1) aşkar olmaq, bəlli olmaq, meydana çıxmaq. *Danışıqdan aydın oldu ki,* [Nəbi kişi] *Həcərin ağ boya ilə işlənmiş şəklini istəyir.* S.Rəhimov. *Bu mənzərəni görərkən hər şey aydın oldu.* Ə.Məmmədxanlı; 2) görünmək, üzə çıxmaq.

◊ **Aydın gün** *məc.* – xoşbəxtlik, səadət, uğur. **Aydın günə çıxmaq** – uzun əzab və çətinlikdən sonra xoşbəxt olmaq. **Gözün aydın (olsun)!** – xoş bir münasibət və sevincli bir hadisə ilə əlaqədar olaraq söylənilən təbrik ifadəsidir. ..*Yardan xəbər gəlibdi; Gözlərin aydın olsun.* (Bayatı).

**AYDINCA(SINA)** *zərf* Aydın surətdə, açıq-aydın, lap aydın. *Səs aydınca eşidilir.*

– *Uzaqda qurulmuş çadırlar da aydınca görünürdü*. Çəmənzəminli.

**AYDINLANMA** "Aydınlanmaq"dan *f.is.*

**AYDINLANMAQ** b a x **aydınlaşmaq.**

**AYDINLAŞDIRILMA** "Aydınlaşdırılmaq"dan *f.is.*

**AYDINLAŞDIRILMAQ** *məch.* Aydın edilmək, aşkar edilmək, müəyyən edilmək, izah edilmək.

**AYDINLAŞDIRMA** "Aydınlaşdırmaq"dan *f.is.*

**AYDINLAŞDIRMAQ** *f.* Aydın etmək, aşkar etmək, müəyyən etmək, bəlli etmək, açmaq, izah etmək. *Məsələnin qaranlıq tərəfini aydınlaşdırmaq. Vəziyyəti aydınlaşdırmaq. – İzahat işləri fəhlələrə güclü təsir bağışlayır və məsələni aydınlaşdırırdı.* M.S.Ordubadi.

**AYDINLAŞMA** "Aydınlaşmaq"dan *f.is.*

**AYDINLAŞMAQ** *f.* 1. Aydınlıq olmaq, açılmaq, buluddan və s.-dən təmizlənmək. *Göy üzü aydınlaşdı. Axşamdan hava buludlu idi, səhərə yaxın aydınlaşdı.*

2. Aşkar olmaq, aydın olmaq, bəlli olmaq, məlum olmaq, müəyyənləşmək. *Məsələ aydınlaşdı. Vəziyyət aydınlaşdı. Fikir hələ tamamilə aydınlaşmamışdır.*

3. Yaxşı görünmək, aydın görünməyə başlamaq. *Gün çıxdı, dağların başı aydınlaşdı.*

**AYDINLATMA** "Aydınlatmaq"dan *f.is.*

**AYDINLATMAQ** *f.* İşıqlandırmaq, nurlandırmaq. // Məc. mənada. *Qara simasını süni təbəssüm işığı ilə aydınlatmağa çalışdı.* M.İbrahimov.

**AYDINLIQ** *is.* 1. Ay işığı, mahtab; açıq və işıq hava. // Sif. mənasında. *Aydınlıq gecə. – Ülkər aydan ucadır; Nə aydınlıq gecədir; Mənim halım pis keçir; Sənin halın necədir?* (Bayatı). *Əvvəlinci məclis vaqe olur Heydər bəyin obasından kənar, bir böyük palıd ağacının dibində, aydınlıq gecədə.* M.F.Axundzadə. *Aydınlıq gecədə, gözəl bir çeşmənin kənarında cavanlar halə qurub əyləşib, növbə ilə oxuyub-çalanlara qulaq verirdilər.* Ə.Haqverdiyev.

2. İşıq, nur. *Ey, gözüm aydınlığı, zülmətdən ənvar istəmə.* Nəsimi.

3. İşıqlı yer. *Ovçular aydınlıqda oturub söhbət edirdilər.*

4. *məc.* Xoşbəxtlik mənasında. □ **Aydınlığa çıxasan!** – "xoşbəxt olasan!", "yaxşı gün görəsən!" mənasında təşəkkür, təbrik ifadəsi. **Aydınlığa çıxmaq** – xoşbəxtliyə çatmaq, rahat və məsud həyata çatmaq. **Aydınlıq içində olmaq** – xoşbəxt və rahat həyat keçirmək. [Xırda xanım:] *Bala, aydınlıq içində ol, imanın kamil olsun.* N.Vəzirov.

**AYDIRMAQ** *f. məh.* Anlatmaq, sezdirmək, başa salmaq, qandırmaq.

**AYƏ**[1] *is.* [*ər.*] 1. *din.* Quran surələrinin müstəqil mənası olan cümlələrindən hər biri. *Yasin surəsinin ayələri. – Ancaq böyüyüb savadımı artırandan sonra bildim ki, həmin ibarə Quran ayəsidir.* C.Məmmədquluzadə.

2. *məc. dan.* Hökm, ehkam, qanun, əmr mənasında. *Onun dedikləri bizim üçün ayə deyil.*

**AYƏ**[2] *dan.* b a x **aya**. [Məşədi İbad:] *Qonaqlar bu evdə olanda, mən o biri otaqda səhərdən bəri fikirdə idim ki, ayə mənim eybim nədir?* Ü.Hacıbəyov.

**AYƏT** b a x **ayə**[1]**.** *Yetmiş min ayətə dəlil olursan.* Xətayi.

**AYƏTULLAH** *is.* [*ər.*] 1. Allahın nişanəsi.

2. Din xadimlərinə verilən rütbə.

**AY-HAY** *nida, dan.* Kinayə, istehza, narazılıq və s. ifadə edir. *Ay-hay, səndən də qorxacağıq!* – [Surxay:] *Ay-hay, elə biz mədəndə oyun çıxarırıq da..* S.Rəhman. *Fəhlələrdən biri dedi: – Ay-hay, elə bilirsiniz pəncərə açıqdır?* "Kirpi".

**AYI** *is.* 1. Uzun tüklü, ağır gövdəli, hər şey yeyən iri yırtıcı heyvan. *Boz ayı. Ağ ayı* (ağtüklü, qütb ayısı). *Qafqaz ayısı. – Meşənin dərinliklərində qaraqıllı ayılar hərlənir, sərt otlaqlarda canavarlar dolaşırdı.* S.Rəhimov. □ **Ayı potası** – ayı balası. *Mağara o qədər kiçik idi ki, içindəki iki ayı potası apaçıq görünürdü.* A.Şaiq.

2. *məc. dan.* Qaba, kobud, yöndəmsiz, yontulmamış adam haqqında.

◊ **Dağ ayısı** – b a x **ayı** 2-ci mənada.

**AYIB** *is.* [*ər.* eyb] 1. Utanılacaq şey, utanmağa səbəb olan hal; ar, biabırçılıq. *Ayıb iş. – Ayıb söyləyənin aybını söylərlər.* (Ata. sözü). [Həpir:] *Mənə ayıb olar ki, atam bu qoca vaxtında güzəran qeydi çəkə.* Mir Cəlal.

2. Qüsur, nöqsan, çatışmazlıq. *Gərdənində, qamətində ayıb yox; Amma nə gözəldir pərişan zülfün!* M.P.Vaqif. □ **Aybı açılmaq** – ifşa olunmaq, qüsur və nöqsanlarının üstü açılmaq, biabır olmaq. **Aybı çölə düşmək** – sirr və nöqsanları camaata məlum olmaq, rüsvay olmaq. **Aybı gəlmək** – b a x **aybına gəlmək**. **Aybı örtülmək** – qüsur və nöqsanlarının üstü pərdələnmək, ayıbları gizlində qalmaq. **Aybına gəlmək** – özü üçün nöqsan və qəbahət saymaq, utanmaq, xəcalət çəkmək. **Aybına kor olmaq** – öz ayıb və nöqsanlarını anlayaraq peşman olmaq, utanmaq, xəcalət çəkmək. **Aybını açmaq** – nöqsan və qüsurunun üstünü açmaq, ifşa etmək. **Aybını örtmək** – qüsur və ayıblarının üstünü pərdələmək, gizlətmək, ört-basdır etmək. **Aybını üzünə vurmaq** – nöqsanını üzünə deyib utandırmaq. **Ayıb saymaq** – nöqsan hesab etmək, nöqsan bilmək, qüsur saymaq. **Ayıb tutmaq** – nöqsanlı hesab etmək, qüsur bilmək, nöqsanını, qüsurunu göstərmək.

**AYIBALASI** *is. məh.* Saman qarışdırılmış palçıqdan hazırlanan çiy kərpic. *Çayın qurtaracağında ayıbalasından tikilmiş bir bina vardı.* S.Rəhimov. [Əkbər] *daha qapı-qapı düşüb "ayıbalası" kəsməyəcəkdi*. Mir Cəlal.

**AYIBALDIRĞANI** *is. bot.* Baldırğana oxşar yemlik yabanı bitki. *Budaq müxtəlif qanqalları qırar, dəvədabanıları qoparar, ayıbaldırğanlarını doğrayar və silos maşınının yanına gətirərdi.* Ə.Vəliyev.

**AYIBLAMA** "Ayıblamaq"dan *f.is.*

**AYIBLAMAQ** *f. dan.* Töhmət etmək, məzəmmətləmək, danlamaq, qınamaq. [Həsən:] *Xalq məni ayıblasa da, mən öz hissəmi ayırıb satıram*. A.Şaiq.

**AYIBLANMAQ** *məch.* Töhmət olunmaq, məzəmmətlənmək, danlanmaq.

**AYIBLI** *sif.* Aybı olan, nöqsanlı, qüsurlu. *Ayıblı bir söz danışan yoxdur.* M.Hüseyn. // İs. mənasında. [Vaqif:] *Elə dərd də orasındadır: "Öküzün inildəməkdən qarnı quruldar". "Ayıblı aybını bilsəydi, heç dünyada ayıb olardımı?"*. Çəmənzəminli.

**AYIBSIZ** *sif.* Nöqsansız, qüsursuz. *Ayıbsız gözəl olmaz.* (Ata. sözü).

**AYIBSIZLIQ** *is.* Nöqsansızlıq, qüsursuzluq.

**AYIDÖŞƏYİ** *is. bot.* Meşə altında bitən alaq otu; qıjı. *Ayıdöşəyi sürətlə, lakin çəpəki inkişaf edən kökümsov gövdəyə və külli miqdarda incə köklərə malik, çoxillik .. bitkilərdəndir.* R.Əliyev

**AYIDÜDÜYÜ** *is. bot.* Dağlıq yerlərdə bitən, gövdəsinin içi koğuş bir bitki. *Ayıdüdüyündən uşaqlar partıldaq qayırırlar.*

**AYIQ** *sif.* və *zərf* 1. Bayğınlığı, məstliyi keçmiş, ağlı başında. *İnsanlar*(*ın*) *elə bir vaxtı olur ki, ancaq sərxoş olduğu zaman özünü ayıq hiss edə bilir.* M.S.Ordubadi.

2. Yuxuda olmayan, oyanıq, sərvaxt. *Hamı yatmışdı, tək mən ayıq idim*.

3. *məc.* Sayıq, gözüaçıq, ağlı başında, özünü aldatmayan, ehtiyatlı, sağlam fikirli. *Ayıq adam. Ayıq olmaq. İşlərə ayıq baxmaq.* – *İclas bitdikdən sonra tək-tək yoldaşlarla söhbət edir və ayıq olmalarını tapşırırdım.* M.S.Ordubadi. *Həmişə ayıq olan Araz yaxınlıqda ayaq səsləri eşidib yerindən dik atıldı.* A.Şaiq. □ **Ayıq salmaq** – qəflətdə olanı ayıltmaq, ayılmasına səbəb olmaq. *Puan Qay çinliləri ayıq salır, onlara edilən zülmü öz oyunları ilə nümayiş etdirir.* S.S.Axundov. *Dəstədən bir nəfər dilləndi: – Növbətçi görər, siqnal verib almanları ayıq salar.* M.Hüseyn. [Firidun] *itləri ayıq salacağından qorxaraq, nəfəsini belə çıxarmırdı*. M.İbrahimov.

**AYIQLIQ** *is.* Ayıq adamın halı. *Yarı huş və yarı ayıqlıq aləmində ona* [Azadiyə] *elə gəlirdi ki, qurtarmaq bilməyən bir çaydan keçməkdədir*. M.İbrahimov. // Sayıqlıq. *Bu ayıqlığın qabağında* [*Cuma*] *nə qayıra bilərdi.* Ə.Əbülhəsən.

**AYIQ-SAYIQ** b a x **ayıq** 3-cü mənada. *Ayıq-sayıq dayanmaq.*

**AYIQULAĞI** *is. bot.* Həmişəyaşıl yarımkol bitki. *Ayıqulağı həmişəyaşıl halda olan yarımkol bitkidir, yerlə sürünən qol-budaqlı gövdəyə malikdir, .. çəhrayı rəngli gözəl, salxım çiçəkləri vardır.* R.Əliyev.

**AYIQYATAN** *f.sif.* Bərk yatmayan, hər hansı səs və ya hərəkətdən yuxudan tez oyanan. *Havva ayıqyatan adam idi.* Mir Cəlal.

**AYILMA** "Ayılmaq"dan *f.is. Həkim xəstənin ayılmasını gözlədi.* M.Hüseyn.

**AYILMAQ** *f.* 1. Yuxudan oyanmaq, yuxudan durmaq. *Gün dağlara yayıldı; Hər bir yatan ayıldı.* A.Səhhət. *Xan səsə yuxudan ayıldı. Əvvəl qulaqlarına inanmayıb durdu, yatağının üstə oturdu.* Çəmənzəminli.

2. Bayğınlığı, sərxoşluğu keçmək, özünə gəlmək; huşa gəlmək, gözlərini açmaq. *Sitarə xəyalatdan ayıldı. Yengələr ona gəlin otağında "təlim" verirdilər.* Çəmənzəminli. [Salmanov] *çaxır boçkası kimi doldurub qarnını, üç günə ayılmaz.* S.Rəhman.

3. *məc.* Gözü açılmaq, fəaliyyətə gəlmək, hərəkətə gəlmək, qəflət yuxusundan ayılmaq, canlanmaq. *Hamı bu on ilin müddətində lazımınca ayılıbdır.* Ə.Haqverdiyev. *Çərxin əcəba seyri də min babət olurmuş; Millət ayılıb talibi-hürriyyət olurmuş!* M.Ə.Sabir.

**AYILTMA** "Ayıltmaq"dan *f.is.*

**AYILTMAQ** *f.* 1. Yuxudan oyatmaq, ayılmağa, gözlərini açmağa məcbur etmək. *Telefonun zəngi bizi yuxudan ayıltdı. – Kərim bəy dərhal Güləndamı ayıltdı; qız özünü itirdi.* Mir Cəlal. *Səhər yuxusundan ayıldır məni; Sinəmə sığmayan böyük duyğular.* S.Vurğun.

2. Özündən getmiş və ya sərxoş adamı özünə gətirmək, huşa gətirmək. *Sərxoşu ayıltmaq. Özündən getmiş qızı həkim ayıltdı.*

3. *məc.* Gözünü açmaq, başa salmaq, qəflət yuxusundan oyatmaq; bilmədiyi, xatırında olmadığı şeyi yadına salmaq. *Axırı bir gün atası rəhmətlik hesabdar Gəldiyevi ayıltdı.* Mir Cəlal. [Sonralar] *xalqımızı ayıltmaq üçün ziyalıların çalışdığını dərk etməyə başladım..* H.Sarabski. // Ayıq salmaq, duyuq salmaq. *Düşməni ayıltmaq olmaz, onlar da güclüdürlər.* N.Vəzirov.

**AYIN-OYUN** *is. dan.* 1. Evin ehtiyacı üçün bazardan alınan gündəlik şeylər, xırda-xırda. [Şahmar bəy:] *Mən gedirəm Hacı Osmanın yurduna, görüm nə var, nə yox, .. bir az da ayın-oyun gətirim.* N.Vəzirov. // Ümumiyyətlə, xırım-xırda şey. *Həmzənin çoxdan söndürülmüş mağazasında, deyəsən, yenə ora-buranı axtaran, ayın-oyun tapıb aparanlar vardı.* Ə.Əbülhəsən. *İbrahim hər gün çıxıb bazara, ayın-oyundan gətirib qarı ilə yeyirdi.* (Nağıl).

2. *məc.* Mənasız, boş söz; cəfəngiyat. *Ayın-oyun danışmaq.*

**AYIN-ŞAYIN** *zərf dan.* Arxayın, nigarançılıqdan uzaq, rahat, asudə. [Hacı Baxşəli:] *Cəlilin toyunun tədarükündə idim ki, birdən ayın-şayın gəzdiyi yerdə, bax, boynunun burasından .. bir yara çıxdı.* C.Məmmədquluzadə.

**AYIOYNADAN** *is. köhn.* 1. Keçmişdə ayı oynadıb pul yığmaqla məşğul olan adam.

2. *məc.* Məsxərəçi, zarafatçı, oyunbaz.

**AYIRD**: **ayırd etmək (eləmək)** – 1. Yoxlayıb müəyyənləşdirmək. *Məsələni ayırd etmək.* – [Qoca keşikçi:] *Mən davanızı ayırd edərəm, – dedi.* M.Hüseyn. [Kərəmov:] *Yaxşı, bu məsələlərin hamısını iclasda ayırd eləyərik.* S.Rəhman.

2. Ayırmaq, fərqləndirmək, seçmək, yaxşını pisdən, irini xırdadan və s. ayırmaq. *Bizim bu günə qədər haqqı batildən seçməkdə və doğrunu əyridən ayırd etməkdə yanlışlığımız bu cəhətdəndir...* M.F.Axundzadə.

3. Dalaşanları, tutuşanları, mübahisə edənləri bir-birindən ayırmaq. *Bəziləri didişir, böyük yoldaşları onlara acıqlanır, onları ayırd edirdi.* S.Rəhimov.

**AYIRICI** *is. xüs.* Bir şeyi növlərə, çeşidlərə ayıran, çeşidçi (fəhlə, maşın).

**AYIRMA** "Ayırmaq"dan *f.is.*

**AYIRMAQ** *f.* 1. Bütöv halda olan şeyi parçalamaq, yaxud onun bir hissəsini götürmək, qoparmaq. *Yumurtanın sarısını ağından ayırmaq. Sümüyü ətdən ayırmaq. Maddəni tərkib hissələrinə ayırmaq.*

2. Əlaqəsini kəsmək, rabitəsini kəsmək, bir-birindən uzaqlaşdırmaq, aralı salmaq. *Tale onları bir-birindən ayırdı. Ailəsindən ayırmaq. Vətənindən ayırmaq. – Dağların dağı məni; Bağçası, bağı məni; Mən səndən ayrılmazdım; Ayırdı yağı məni.* (Bayatı). *Ayırdı məndən o məhruyi biməqam fələk.* S.Ə.Şirvani. [Qədir] *özünü kütlədən, yəni "qara camaatdan" ayırmaq üçün həmişə hamı deyənin ziddinə gedir.* Mir Cəlal.

3. Aralamaq, kənara çəkmək, bir-birindən uzaqlaşdırmaq. *Dalaşanları ayırmaq. Buzovu*

*anasından ayırmaq. Uşağı döşdən ayırmaq* (böyüdüyü üçün uşağa daha süd verməmək, əmizdirməmək).

4. Təcrid etmək, başqalarından ayırmaq, uzaqlaşdırmaq, başqaları ilə əlaqəsini kəsmək. *Xəstələri sağlamlardan ayırmaq. Uşağı zərərli mühitdən ayırmaq.*

5. Yarmaq, şaqqalamaq, parçalamaq, kəsmək. *Kötüyü balta ilə dörd yerə ayırmaq. Qoyunun cəmdəyini beş yerə ayırdılar.*

6. Bölmək, təqsim etmək. *Şeyləri ikiyə ayırmaq. Hər kəsin payını ayırıb özünə verdi. Otağı pərdə ilə iki hissəyə ayırmaq.*

7. Seçmək, fərqləndirmək. *Yaxşını pisdən ayırmaq. Safı çürükdən ayırmaq. Dənin irisini xırdasından ayırmaq.*

8. İstifadə üçün vermək, ixtiyarına vermək, təxsis etmək. *Uşaq üçün otaqda bir guşə ayırmaq. Ləvazimat almaq üçün pul ayırmaq. Laboratoriya üçün avadanlıq ayırmaq. – Gəldiyev Ağca xanımın xəcalətindən çıxmaq üçün tələbələrə gələn güzəştli biletdən iki dənə ayırır, Ağca ilə getməli olurdu.* Mir Cəlal.

9. Nəzərə çarpdırmaq, fərqləndirmək. *Mətnin əsas yerlərini qara hərflərlə ayırmaq.*

**AYISOĞANI** *is. bot.* Çəmənlərdə bitən soğanaqlı bitki.

**AYIŞMA** "Ayışmaq"dan *f.is.*

**AYIŞMAQ** *f.* Gicişmək. *Gözü ayışmaq.*

**AYITMAQ** *f. qəd.* Demək, söyləmək. *Olma məlul, ayıtma kim, bəndü hasar içindəyəm.* Nəsimi. *Şah Xətayi aydır: – sirrini yayma.* Xətayi.

**AYİN** *is.* [*fars.*] 1. Qayda, qanun. *Gəlmədi, saçı arasında yəqin itdi könül; Rəsm-ayindir, olur şami-qaranqudə bəla.* Q.Zakir. // Dəb, adət, üsul.

2. Dini mahiyyətdə olan mərasim; ibadət. *Dini ayinlərin icrası. – Aldanmaram ki, doğrudur ayinin, ey əmu; Kəssin məni, həqiqi isə dinin, ey əmu!* M.Ə.Sabir. // Məc. mənada. *Səcdədir hər qanda bir büt görsəm ayinim mənim; Xah mömin, xah kafir tut, budur dinim mənim.* Füzuli.

**AYİNƏ** *is.* [*fars.*] b a x **ayna** 1-ci mənada. *Ol məhi-namehriban istər ki, zülfün darasın; Sən götür ayinə, ey gün, ey qəmər, sən şanə tut.* S.Ə.Şirvani. *Şairəm, əsrimin ayinəsiyəm; Məndə hər kəs görür öz qaşgözünü.* M.Ə.Sabir. *Ədəbiyyat* [xalqın] *ayineyi-həqiqətnümasıdır ki, onun maddi və mənəvi tərəqqisini və istiqbalı üçün nicat və səadət yollarını eyni ilə göstərir.* F.Köçərli.

**AYİNƏDAR** *is.* [*fars.*] Aynatutan (keçmiş zamanlarda bir böyük adam geyinərkən, onun qabağında güzgü tutan xidmətçi).

**AYQABAQ(LI)** b a x **aybəniz**. *Buludzülflü, ayqabaqlı gözəlin; Duruban başına dolanmaq gərək.* M.P.Vaqif.

**AYQIR** *is.* Döllük erkək at. *At zavodunda cins ayqırlar yetişdirilir. – Ayqır başını qaldırıb ilxıya gələn qatıra diqqətlə baxdı.* S.Rəhimov.

**AYLAM** *is. məh.* Dairə, dövrə, halqa.

**AYLANDIRMA** "Aylandırmaq"dan *f.is.*

**AYLANDIRMAQ** *f.* Dolandırmaq, fırlandırmaq; aylanmağa, fırlanmağa, hərlənməyə məcbur etmək.

**AYLANMA** "Aylanmaq"dan *f.is.*

**AYLANMAQ** *f.* 1. Dolanmaq, fırlanmaq, hərlənmək.

2. Gicəllənmək, dönmək. *Başı aylanmaq.*

◊ **Dünya başına aylanmaq** – çox mütəəssir olmaq, başa gələn bir hadisə üzündən dərin iztirab və ya ruhi sarsıntı keçirmək. [Rüstəm bəy:] *Haradasan oğul, .. yaraların yadıma düşəndə, dünya başıma aylanır.* N.Vəzirov.

**AYLI** *sif.* Ay işığı ilə işıqlanmış, mahtab. *Aylı gecələr. – Göy üzü dumduru, aylı bir gecə.* M.Rahim.

**AYLIQ** 1. *sif.* Ayda bir dəfə olan, hər ay olan, bir ayda görülən, bir aya məxsus, ayda bir dəfə çıxan. *Aylıq iş planı. Aylıq hesabat. Aylıq məcmuə.*

2. *sif.* Bir ay müddəti, bir ay davam edən, bir ay tələb edən, bir ayda hasil olan (əmələ gələn). *Aylıq gəlir. Aylıq məzuniyyət. Aylıq məhsul.* // Saylarla bərabər – bir, iki, üç ... aylıq. *Biz qaçanların hamısının özünü və ailəsini bir aylıq məsariflə təmin etmişik.* M.S.Ordubadi. [Fikrət:] *Bəzən bir boran altı-yeddi aylıq əməyimizi bircə dəqiqənin içərisində puça çıxarır.* M.Hüseyn.

3. *is. dan.* Bir ayda alınan maaş, məvacib, zəhmət haqqı. *Aylığımızı dünən almışıq.*

*Aylığımız artmışdır. – Papaqçı dedi: – Bala, mənə şagird durarsanmı? Rəsul dedi: – Nə üçün durmaram. Aylığım neçə olacaq?* “Aşıq Qərib”. *Kərim baba inəkləri aylıq ilə güdərdi.* A.Şaiq. [Bayram:] *Mədəndə bundan dörd qat az alırdım, indi, şükür Allaha, aylığım pis deyil.* M.Hüseyn.

4. *is*. Hər hansı bir işi, ictimai kampaniyanı keçirmək üçün bir aylıq müddət. *Şəhəri yaşıllaşdırma aylığı. – Cabbarlı 1929-cu ildə Zaqafqaziya xalqlarının mədəni birliyi aylığında iştirak etmişdi.* M.Arif.

5. Yaşı bir ay olan, 30 günlük. *Aylıq uşaq. Aylıq quzu.*

**AYLIQÇI** *sif.* Ay hesabı ilə, aylıq muzd ilə işləyən. [Qarı:] *Hələ mənim özümü burada aylıqçı qoyub ki, Tiflis şəhərinə yeni gələn qəriblərin xəbərini ona verim.* “Aşıq Qərib”.

**AYLIQÇILIQ** *is.* Aylıqla işləmə.

**AYLIQLI** *sif.* Maaşlı, maaşla xidmət edən, işləyən.

**AYLI-ULDUZLU** *sif.* Ay çıxmış, işıqlı və ulduzlu. *Aylı-ulduzlu bir gecə idi.* M.Hüseyn.

**AYNA** *is.* [*fars.*] 1. Güzgü. *Aynanın çatdığı calaq qəbul eləməz.* (Ata. sözü). *Əgər bilmək istəyirsiniz ki, kimin üzünə gülürsünüz, o vaxt qoyunuz qabağınıza aynanı və diqqət ilə baxınız camalınıza.* C.Məmmədquluzadə. [Həkim:] *Mən ayna ilə üzbəüz oturmuşdum. Qonşu otağın bir hissəsi bu aynada görünürdü.* C.Cabbarlı. // *məc*. Bir şeyi özündə əks etdirən. *Mətbuat həyatın aynasıdır. – Hər bir vilayətin qəzeti gərək o vilayətin aynası olsun, .. o qəzetə baxan xalqı aynada görən kimi görsün.* H.Zərdabi. *Qarşımda iki lövhə, keçən günlər aynası.* R.Rza.

2. Pəncərə, pəncərə şüşəsi. *Ayna salmaq. Aynadan küçəyə baxmaq. Pəncərənin aynaları qırılıbdır.*

3. *məc.* Saflıq, duruluq, parlaqlıq, şəffaflıq mənasında təşbih. *Ayna kimi suyun üzü bərq vurar; Məxmər kimi otun üstü xovlanar.* A.Səhhət. *Tarixi binalar kimi bir çox; Evlər görürəm ayna sularda.* M.Müşfiq. *Çaylar axıb ayna kimi durulur; Görən deyir, nə göyçəkdir kəndimiz.* Z.Xəlil. // Gözəllik, ağlıq mənasında təşbih. *Çən alıb dağlar başın; Bağ başın, bağlar başın; Camalın bir aynadır; Hər görən bağlar başın.* (Bayatı). *Günəş kimi nur çiləyir; Hər tərəfə od ələyir; Könlümü məftun eləyir; Ayna üzü gözəllərin.* Aşıq Pənah.

◊ **Aynası açıq** *dan.* – 1) özünü bir qədər yaxşı hiss edən xəstə haqqında; 2) xoşrəftar, mehriban, üzügülər adam haqqında. **Aynası açılmaq** – 1) ağır xəstəlikdən ayılmaq, əhvalı yaxşılaşmaq; 2) kefi açılmaq, ürəyi açılmaq. *..Onsuz gülməz üzüm, açılmaz aynam..* M.Müşfiq.

**AYNABƏND** *is.* [*fars.*] 1. Şüşəli balkon, pəncərələri çox böyük olan otaq, şüşəbənd. *Pəncərəsi aynabəndə çıxan kiçik otaqda yorğan-döşək yığmaq üçün bir aynalı divar şkafi var.* S.Rəhman. *Batan günün şöləsilə yanar neçə aynabənd.* Ə.Cəmil. *Hüseynağa aynabəndə çıxan kimi gözləri divanın yanında durmuş Zeynəbə sataşdı.* M.İbrahimov.

2. Bitki yetişdirmək üçün şüşəbənd.

3. Pəncərə, vitrin. *Dəmirov pəncərədən açılmış mağazalara, geniş aynabəndlərə baxırdı.* S.Rəhimov.

**AYNABƏNDLİ** *sif.* Aynabəndi olan, şüşəbəndli, hər tərəfi şüşəli, pəncərəli (bina, otaq və s.). *Məhkəmə yuxarı məhəllənin tinində ikimərtəbə, uzun aynabəndli evdə idi.* Mir Cəlal. [Tahir] *ağ daşdan tikilmiş birmərtəbəli aynabəndli evin qabağında “Moskviç”i gördü.* M.Hüseyn. *İpək məxmər pərdələr aynabəndli pəncərələri bəzəyirdi.* S.Rəhimov.

**AYNACIQ** *is. dan.* Kiçik ayna, balaca güzgü. *Burada üç çilçıraq, kiçik aynacıqların qabarıq ornamentləri, mozaika və s. nəzərdə tutulmuşdur.* “İncəsənət”.

**AYNAÇI** *is.* 1. *köhn.* Şüşəsalan, aynasalan, aynasaz.

2. *köhn.* Keçmişdə zadəgan ailələrində: xanım geyinərkən onun qabağında ayna tutan xidmətçi. b a x **aynatutan**.

**AYNAÇILIQ** *is.* Aynaçı sənəti.

**AYNALAMA** “Aynalamaq”dan *f.is.*

**AYNALAMAQ** *f.* 1. Güzgüləmək, güzgü vurmaq, güzgü salmaq. *Şifoneri aynalamaq.* // Parıldatmaq, cilalandırmaq.

2. Şüşə salmaq (pəncərəyə və s.-yə). *Pəncərələri aynalamaq. Şkafi aynalamaq.*

**AYNALANMA** “Aynalanmaq”dan *f.is.*

**AYNALANMAQ** *məch.* 1. Güzgülənmək, güzgü vurulmaq (salınmaq).

2. Şüşə salınmaq (pəncərəyə və s.-yə).

**AYNALATMA** “Aynalatmaq”dan *f.is.*

**AYNALATMAQ** *f.* 1. *köhn.* Xəncərə və s. silahlara cila verdirmək, parıldatmaq.

2. Şüşə saldırmaq (pəncərəyə və s.-yə).

**AYNALI**[1] *sif.* 1. Aynası, güzgüsü, ya şüşəsi olan. *Aynalı şkaf. Aynalı otaqlar. Aynalı bufet. – Yorğun-arğın insanlar işdən sonra; Yığılmışdı divarları daş aynalı bir salona.* S.Vurğun.

2. Pəncərəli, pəncərəsi olan.

**AYNALI**[2] *is. köhn.* Patronu üstdən qoyulan təklülə tüfəng (bəzən “aynalı tüfəng” şəklində işlədilir). *Aynalını təmizləyib qurtaran Həcər, aynalı ilə oynamağa başladı.* S.Rəhimov. *Nəbi aynalı tüfəngini götürüb düşmən qabağına getmək istəyərkən qaraçılar qoymurlar.* “Qaçaq Nəbi”.

**AYNASAZ** *is.* [*fars.*] b a x **aynaçı** 1-ci mənada.

**AYNATUTAN** *is. etnoqr.* Köhnə məişətdə: gəlin gedərkən onun qabağında güzgü aparan şəxs.

**AYNIMAQ** *f. dan.* 1. Sağalmağa başlamaq.

2. Başı açılmaq, azad olmaq, yüngülləşmək (işdən). *Başım heç işdən aynımır.*

**AYPARA** *is.* 1. Ayın nazik qövs şəklində olan dövrü; hilal; yeni ay, bir-iki günlük ay. // Bu cür Ay şəkli. *Yenə də Rüxsarə, üstündə qırmızı aypara olan həkim çantasını çiyninə salacaq, sökülən dağı, yıxılan meşələri dolanacaqdır.* S.Rəhimov.

2. *köhn.* Qızıl, ya gümüşdən qayrılan yarımdairə şəkilli qadın bəzəyi.

3. B a x **ay parçası** 2-ci mənada (“**ay**[1]”da). *Ayparatək üzə bax; Qələm qaşa, gözə bax; Deyirsən sevim səni; Anam deyən sözə bax!* (Bayatı). *Reyhan mavi göylərdən yerə enmiş bir ayparadır.* M.Hüseyn.

◊ **Qızıl Aypara Cəmiyyəti** – bəzi Şərq xalqlarında Qırmızı Xaç Cəmiyyətinin vəzifəsini daşıyan könüllü təşkilatın adı (keçmişdə buna Hilal əhmər cəmiyyəti deyilərdi). *Qızıl Aypara Cəmiyyəti üz verən fəlakətlə əlaqədar Yəmənə 50 ton buğda unu, 10 min metr ağ bez və 1500 ton sement göndərmişdir.*(Qəzetlərdən).

**AYPARALI** *sif. köhn.* Üzərində aypara kimi bəzəyi olan, üzərində aypara olan. *Ayparalı don. Ayparalı bayraq. Ayparalı başlıq.* // Üzərində aypara şəkli olan, üzərində aypara çəkilmiş. *Rüxsarə çiynindən asılmış ayparalı çantaya baxdı.* S.Rəhimov.

**AYRAN** *is.* Yağı alınıb su qarışdırılmış qatıq. *Heç kəs öz ayranına turş deməz.* (Ata. sözü). *Masanın üzərində böyük bir mətərə buzlu ayran qoyulmuşdu.* M.S.Ordubadi. *Qızxanım parçı ağzına qədər ayranla doldurub Almurad ağaya verdi.* İ.Əfəndiyev. [Göyçək] *ayranı çürüdüb şor elədi.* Ə.Vəliyev.

**AYRANAŞI** *is. məh.* b a x **ayrançilo.**

**AYRANÇİLOV** *is. məh.* Ayranda bişirilən aş.

**AYRANLIQ** *is. məh.* İtlərə ayran tökmək üçün qazılan çuxur, çala.

**AYRI** 1. *zərf* Xüsusi, tək, başqası ilə bağlı olmayaraq, müstəqil, özbaşına. *O, ata-anasından ayrı yaşayır. Ayrı gəzib dolanmaq.* ☐ **Ayrı düşmək** – aralı düşmək, uzaq düşmək, uzaqlaşmaq, əlaqəsini itirmək. *Ailədən ayrı düşmək. – Vətəndən ayrı düşüb indi laməkan ölürəm.* X.Natəvan. *Alagözlü, səndən ayrı düşəli; Ah çəkməkdən bağrım qana dönübdür.* Aşıq Ələsgər. *Sənin vəziyyətin o qədər də çıxılmaz .. deyil, sən ancaq bir-iki gün öz ailəndən ayrı düşmüsən.* M.S.Ordubadi. **Ayrı salmaq** – ayırmaq, uzaqlaşdırmaq, əlaqənin kəsilməsinə səbəb olmaq. *Gəlin, çox yormayın sevgilinizi; Fələk ayrı saldı deyəsən bizi.* S.Vurğun.

2. *sif.* Başqa, əlahiddə, qeyri, digər. *Ayrı bir iş. Ayrı məsələ. Ayrı adam. Onun paltarı ayrı parçadandır. – Gördü bir ayrı arı bu halı; Arılardan soruşdu əhvalı.* S.Ə.Şirvani. *Mən də: – Məlik Məmməd, Qırat nağıllarından ayrısını bilmirəm, – deyə bacım kifayətləndi.* S.S.Axundov.

3. Qoşma mənasında. *Qərar etməz könül zülfündən ayrı.* Nəsimi. *Səndən ayrı bağrım kababə dönmüşdür.* M.P.Vaqif.

**ayrı-ayrı** *zərf* Hər biri ayrıca olaraq, başqa-başqa, bircə-bircə. *Hər kəsi ayrı-ayrı başa salmalı. – Axşamçağı idi, kənd əhalisi*

*işlərini qurtarıb, arvadlar və kişilər ayrı-ayrı küçə ağzında .. çömbəlmiş oturmuşdular.* B.Talıblı. // Tək-tək, bəzi. *Ayrı-ayrı tənqidi qeydlər. – Bağ-bağça öz yaşıl donunu çoxdan tökmüş, ayrı-ayrı ağaclarda beş-on saralmış yarpaqdan başqa bir şey qalmamışdı.* M.İbrahimov. ☐ **Ayrı-ayrılıqda** – təklikdə, birini təklikdə götürdükdə, öz-özlüyündə.

**AYRIC** *is.* Bir neçə yolun ayrıldığı və ya bir yolun bir neçə tərəfə haçalandığı yer (adətən "yol" sözü ilə bərabər işlənir). *Ayna və Sənəm qarı da yol ayrıcına çatdılar.* Ə.Məmmədxanlı. *Yorğun əsrlərin yol ayrıcında; Durmusan dağ kimi böyük sənətkar!* R.Rza.

**AYRICA** 1. *zərf* Ayrı olaraq, xüsusi olaraq, təklikdə. *Ayrıca oturmaq. Ayrıca yaşamaq. Bu barədə ayrıca danışarıq.*

2. *sif.* Xüsusi, ayrı, tək. *Ayrıca otaq. Ayrıca loja. Ayrıca yol. – Fatma Məsmənin uşaqları üçün ayrıca yağlı fətir kündəsi hazırlamışdı.* Mir Cəlal.

**AYRIQ**, **AYRIQOTU** *is. bot.* Çoxillik taxıllar fəsiləsinə mənsub ot.

**AYRILIQ** *is*. 1. Başqalıq, müxtəliflik, bir-birinə bənzəməzlik; fərq, uyğunsuzluq. *Fikir ayrılığı. Üsul ayrılığı. Bunların arasında heç bir ayrılıq yoxdur.*

2. Yaxın adamlarından, sevgilisindən, dostundan uzaqda keçən həyat; hicran, fəraq, firqət. *Ayrılığa dözməmək. – Əğyar aramıza saldı ayrılıq; Getdi canan yüz naz ilə, gəlmədi.* Aşıq Dilqəm. *Zimistan oldu, gənə gəldi bahar; Ayrılıq eylədi məni intizar.* Aşıq Pəri. *Mən ki doymamışdım heç vüsalından; Mənə zülm elədi yaman ayrılıq.* N.Rəfibəyli. // Ayrılma. [Cəmil bəy:] *Ayrılıq zamanı yaxınlaşınca birdən-birə gözlərim yaşardı.* H.Cavid.

**AYRILIQDA** *zərf* 1. Ayrı olaraq, ayrıca. *Məktəblərdə oğlanlarla qızların ayrılıqda təhsil almaları göstərdi ki, bu təhsil sistemi özünü doğrultmur.* "Az. qad."

2. Təklikdə, xüsusilikdə; xəlvəti. *Bu sirri sənə ayrılıqda deyərəm.*

**AYRILIŞ** *is*. Ayrılmaq işi, ayrılma. [Nina] *son dəfə əlimi sıxdıqda, sanki barmaqları və damarları da bu ayrılışa etiraz edirdi.* M.S.Ordubadi.

**AYRILIŞMA** "Ayrılışmaq"dan *f.is.*

**AYRILIŞMAQ** *f.* Bir-birindən ayrılmaq, əlaqəni qırmaq. *Ortaqlar ayrılışdılar. – Dədəm məni gətirdi evə, üç il qalıb "kəbinim halal, canım azad" deyib seyiddən ayrılışdıq.* Çəmənzəminli.

**AYRILMA** "Ayrılmaq"dan *f.is.*

**AYRILMAQ** *f.* 1. Ayrı düşmək, aralı düşmək, uzaq düşmək, uzaqlaşmaq. *Gülnaz bir neçə addım anasından ayrılıb, özünü qabaqda gedən üç nəfərə çatdırdı.* M.İbrahimov. *Ayna ilə Ayaz küçədə bir-birindən ayrıldılar.* Ə.Məmmədxanlı. // Xudahafizləşmək, vidalaşmaq. *Turxan bəydən ayrıldığımız gecə gözəl bir mahtab var idi.* H.Cavid. // Daha görüşməmək, əlaqəni kəsmək. *Səndən ayrılandan, ey gülbədənim; Həqq bilir, qalmışam sel arasında.* Q.Zakir. *Fəda olum sənə mən, səndən ayrıla bilməm.* X.Natəvan. [Sitarə:] *Mən səndən ayrılmaq istəmirəm, ayrıla bilmirəm, ancaq ayrılıram.* C.Cabbarlı.

2. Xəyalından çıxarmaq, fikrindən çıxarmaq, fikrən uzaqlaşmaq, tərk etmək. [Ağca xanım] *qorxunc təsəvvürlərdən ayrılmaq üçün özünə güc verib gözlərini açdı.* Mir Cəlal. *Laçın meşəyə girəndə öz xatirələrindən ayrıldı.* M.Hüseyn.

3. Qopmaq, aralanmaq. *Çaydanın qulpu ayrıldı. Ağacın budağı gövdəsindən ayrıldı.*

4. Çəkilmək, yerini tərk etmək. *Dəstədən ayrılmaq. Atlı darvazadan ayrılıb yola düşdü.* // Kənara çəkilmək, bir yerdən uzaqlaşmaq. *Kərim babanın .. bir iti vardı. Gecə-gündüz bizim qapımızdan ayrılmazdı.* A.Şaiq.

5. Bölünmək. *Oyunçular iki yerə ayrıldılar. Çay iki qola ayrılmışdır.*

6. Bir yerdə ikən aralanıb müstəqil yaşamağa başlamaq. *Qızlar ərə getdilər, oğlanlar isə ataları öləndən sonra ayrıldılar. Şəriklər ayrıldılar. – Öküz öldü, ortaq ayrıldı.* (Ata. sözü).

7. Aralarındakı ər-arvadlıq əlaqəsini ləğv etmək, bir-birini tərk etmək. *Ərindən ayrılmaq. Arvadından ayrılmaq*.

8. Hər hansı bir xüsusiyyətinə, keyfiyyətinə və s.-yə görə başqalarından fərqlən-

mək, seçilmək. *Qardaşlar bir-birindən çox ayrılırlar. O, yoldaşlarından heç ayrılmır. – Sözün heç ayrılmaz mənim sözümdən; Odlara yanmışam özüm-özümdən.* M.P.Vaqif.

9. Təxsis edilmək, ayrılıb saxlanmaq. *İnşaat üçün külli miqdarda pul ayrılmışdır. Bu kitablar kimin üçün ayrılmışdır?*

◊ **Ayrıla qalmaq** – aralanmaq, açıq qalmaq. *Abbas .. gördü ki, gözləri yumuludur. Amma dodaqları ayrıla qalmışdı.* S.S.Axundov.

**AYRILMAZ** *sif.* 1. Heç vaxt bir-birindən ayrılmayan, çox yaxın, həmişə bir yerdə olan. *Ayrılmaz dostlar. Ayrılmaz bacılar. Ayrılmaz yoldaşlar. – Dünəndən ayrılmaz, bu günə bağlı; Sabaha can atan təşnə bir insan!* Şəhriyar. *Bəlkə də bir simli iki sazıq biz; Sən qansan, mən ürək, ayrılmazıq biz.* M.Araz.

2. Heç bir vaxt bir-birindən ayrıla bilməyən, bir-birindən ayırmaq mümkün olmayan. *Qarabağ əzəldən Azərbaycanın ayrılmaz parçası olmuşdur. – Sevgi gözəllikdə ayrılmaz ərşdir; Biri Aydır onun, biri Günəşdir.* M.Müşfiq.

**AYRILMAZLIQ** *is.* Ayrıla bilməyən şeyin xassəsi; bütövlük, bölünməzlik.

**ÁYRIM** *is.* Azərbaycanın Gədəbəy, Daşkəsən, Tovuz, Qazax və b. rayonlarının dağlıq yerlərində yaşayan, ümumiyyətlə, tarixi Azərbaycanın Göycə, Çəmbərək, Dilican və İcevan kimi ərazilərində yaşamış azərbaycanlıların adı və onlara mənsub adam. *Ayrım bəzəmələri. Ayrımların dilindən yazıya alınmış rəvayətlər.*

**AYRÍM** b a x **ayrıc.** *Atı qabağa sürüb gördüm ki, küçə ayrımında, divarın kölgəsində dörd müsəlman oturub.* C.Məmmədquluzadə.

**AYRI-SEÇKİ** *is.* Tərəfgirlik, üzgörəlik; ədalətsizlik, bir tərəfin üstün tutulması, obyektiv münasibət göstərilməməsi. *Ayrı-seçki salmaq.* – [Mahmud və Xolmoqorsev] *hələ arxada ikən, qışladan şəhərə bərabər gedir, ayrı-seçki bilmədən restoranda yeyib-içir, .. yenə də qışlaya bərabər qayıdırdılar.* Ə.Əbülhəsən.

**AYRI-SEÇKİLİK** b a x **ayrı-seçki.** [Əşrəf] *..atasının iki qardaşın arasında ayrı-seçkilik saldığını xatırlayanda tutuldu.* İ.Şıxlı. *Xəlil ağlı kəsəndən bəri əmisigillə özləri arasında ayrı-seçkilik görməmişdi.* İ.Məlikzadə.

**AYSIZ** *sif.* Qaranlıq, ay işığı olmayan. *Aysız gecədir. Dağlar donmuş nəhəng qara dalğalar kimi dörd tərəfdən Xınalığın üfüqlərini hasarlayıblar.* R.Rza. [Adilə:] – *Nə aylı, nə aysız gecələrdə mənim anam məni gəzməyə buraxmır*. Ə.Məmmədxanlı.

**AYSOR** *is.* Əsas kütləsi İranda və Türkiyədə yaşayan və süryani dili ləhcələrindən birində danışan kiçik bir xalqın adı və bu xalqa mənsub adam. *Aysorlar özlərini qədim assuriyalıların nəsilləri hesab edirlər.*

**AY-ULDUZ** *is. köhn.* Ay-ulduz şəklində qızıldan qadın bəzəyi; boyunbağı. *Ay-ulduz şəbəkə üsulu ilə düzəldilir.*

**AY-ULDUZLU** *sif.* 1. Üzərində ay-ulduz şəkli təsvir olunmuş. *Ay-ulduzlu bayraq.*

2. Döşündə, boynunda ay-ulduz şəklində bəzəyi olan; ay-ulduz taxılmış. *Ay-ulduzlu sinəbənd.*

**AYÜZLÜ** *sif. şair.* Gözəl, göyçək.

**AZ** *sif.* 1. Sayca çox olmayan, cüzi (*çox* ziddi). *Az pul. Az miqdar. Az bilik. İclasa az adam gəlmişdi.* // Çox sürməyən, sürəksiz, çox davam etməyən, tez qurtaran. *Az ömür. Az vaxt. Az* (z.) *yaşamaq. Az* (z.) *sürmək. – Az yeyənin azarı da az olar.* (Ata. sözü). // Kifayətsiz, ehtiyacı ödəməyən (adətən xəbər şəkilçisi ilə). *Bu məbləğ azdır. Yaşına görə təcrübəsi azdır. Onun biliyi çox azdır.* // “Bir” sözü ilə – azacıq, az miqdarda. *Bir az su ver. Bir az gözlə. Bir az dincəl.*

2. Seyrək, nadir, arabir, gec-gec. *Bakıda yağış az olur. Burada yaşıllıq çox azdır. Belə təsadüflər az düşər. Dostlar az görüşürlər.*

3. *İs. mənasında.* Azlıq, əqəliyyət. *Az çoxa tabe olmalıdır.*

4. *İs. mənasında.* Az şey, az miqdar. *Aza qane olmaq. – Azdan az deyiblər, çoxdan çox.* (Ata. sözü).

◊ **Az qala, az qaldı, az qalmışdı –** demək olar ki, həmən-həmən. – *Vallah, qəribə axmaqdırlar bu ingilis tayfaları ki, belə xətərli millət ilə az qalmışdı cəng başlayalar.* M.F.Axundzadə. *Məni az qaldı səyyadi-əcəl seyd eləsin, ey dil! Hanı ol ahuyi-rənayə*

*səyyad olduğum günlər?* S.Ə.Şirvani. *Bəndalı qəlbində doğan təlatümdən az qaldı özünü itirə.* Mir Cəlal. *Usta Ağabalanın səsinə hamamçı dik atılıb az qaldı ocağın üstə qaynayan pitini töksün.* Çəmənzəminli. **Bir azdan** – bir qədər sonra, azacıq sonra. *Bir azdan gələrsən. Bir azdan hazır olar. – Qapı ağzında dayanmış Hacib dönüb getdi və bir azdan əlinə qılınc verilmiş ikinci cəllad içəri gəldi.* Ə.Məmmədxanlı. **Nə az, nə çox** – məhz o qədər, düz, tam. *Nə az, nə çox, düz bir ay yaylaqda qaldım.*

**az-az** *zərf* 1. Yavaş-yavaş, tədriclə. *Xəstə az-az sağalmağa başlamışdır. Uşaq az-az yeriyir. Yağış az-az yağır. İşlər az-az irəliləyir.* // Azca-azca. [Cavadın] *dişgöynədən sulardan az-az, tez-tez içdiyi dəqiqələr gözləri qabağında canlandı.* Ə.Vəliyev.

2. Nadir, gec-gec. [Eldar] *kəndə az-az gəlməyə başlayır*. S.Hüseyn. *Bəy tayfasından belə adam az-az çıxır*. S.Rəhimov.

**AZACIQ** *sif.* və *zərf* Çox az, çox az miqdarda, cüzi. *Mənə azacıq su verin. Azacıq vaxt qalmışdır. Azacıq yemək. – Azacıq aşım, ağrımaz başım.* (Məsəl). *Azacıq məvacibə qənaət edən muzdur öz boğazından qəpik-qəpik kəsib, on ilin ərzində altı yüz manat pul cəm etmişdi.* S.M.Qənizadə. *Həcər qulaq verdi, bu an buludlar azacıq hərəkətə gəldi*. S.Rəhimov.

◊ **Azacıq aşın duzu deyil** – b a x **aş**[1].

**AZAD**[1] *sif.* [*fars.*] 1. Azadlıqdan istifadə edən, başqasından asılı olmayan, sərbəst. *Azad xalq. Azad əmək. Azad həyat. Azad seçki hüququ.*

2. Maneəsiz, əngəlsiz, sərbəst, heç bir şeylə məhdud edilməyən. *Azad ticarət. Azad satış.* // *zərf* Rahat, əziyyətsiz. *Azad nəfəs almaq*.

3. Boş (vaxt haqqında). *Ulduz azad vaxtlarını daima öz kiçik otağında, həvəskarı olduğu rəssamlığa sərf edərdi.* Ə.Məmmədxanlı.

4. *nida.* Hərbi komanda. *Mirbalayev "azad!" komandası verdi.* M.Hüseyn.

◊ **Azad edilmək** – 1) xilas edilmək, qurtarılmaq, buraxılmaq. *Həbsdən azad edilmək*; 2) çıxarılmaq, xaric edilmək. *İşdən azad edilmək. Vəzifəsindən azad edilmək;* 3) tərxis edilmək, buraxılmaq. [Kusov] *üç il bundan əvvəl Qafarın ordudan azad edilərkən birbaş Mingəçevirə gəldiyi günü xatırladı.* Ə.Sadıq. **Azad etmək** – 1) xilas etmək, qurtarmaq. *Nəbi Həcəri azad etdikdən sonra bir müddət İranda qalır*. "Qaçaq Nəbi"; 2) azadlıq vermək, istiqlaliyyət vermək, azadlığını, istiqlaliyyətini özünə qaytarmaq; 3) buraxmaq, mürəxxəs etmək, getməsinə icazə vermək. *Batalyon komissarı bugünkü söhbəti bununla qurtarıb: – "Sağ ol, Nəcəfov!" – deyib, döyüşçünün əlini möhkəm sıxmaqla onu azad etdi.* Ə.Vəliyev; 4) tərxis etmək, buraxmaq. *Əsgərlikdən azad etmək*; 5) çıxarmaq, xaric etmək. *İşdən azad etmək;* 6) bir işi; vəzifəni, mükəlləfiyyəti və s.-ni yerinə yetirmək məcburiyyətindən xilas etmək. *Bədənim zəif olduğundan, məni yay imtahanlarından azad etmişdilər.* İ.Əfəndiyev. **Azad olmaq** – 1) azadlıq əldə etmək, müstəqil olmaq, sərbəst olmaq. *Əsarətdən azad olmaq. – Arif çalışır ki, millət azad olun; Zahid çağırır ki, məscid abad olsun.* M.Ə.Sabir; 2) boşalmaq. *Yerlər azad oldu;* 3) arzu etmədiyi bir vəzifədən, işdən və s.-dən canını qurtarmaq. *Müdirlikdən azad olmaq;* 4) xilas olmaq, qurtulmaq. *Şəhərlər düşmən işğalından azad oldu;* 5) *məc.* doğmaq. *Bir ildə .. Zeynəb üçüncü uşaqdan azad oldu.* M.İbrahimov; 6) işi, məşğələni qurtarmaq. *A qardaşlar, axı bir deyin görüm, mənim nə vecimə ki, səhərlər saat altıda kontora gəlib, axşam saat onda azad olursunuz?* C.Məmmədquluzadə.

**AZAD**[2] *is.* [*fars.*] *bot.* Cənubda bitən bərk oduncaqlı ağac növü. *Azərbaycanda qarağac, dağdağan və azad ağacı cinslərindən olan yabanı şəkildə yayılmış və becərilən növün nümunələrinə təsadüf olunur.* H.Qədirov. *Zorxana oyunu adətlərinin birincisi zorxana mili idi. Bu alət şümşaddan, azaddan və yaxud da palıd ağacından qayrılardı.* H.Sarabski.

**AZADƏ** b a x **azad**[1] 1-ci mənada. *Aşiq azadə gərəkdir ki, dönər zindanə; Bərgigüldən ola gər bülbüli-şeydayə qəfəs.* S.Ə.Şirvani. *Sona xala ah çəkərək dedi: – Kaş oğlum Bəşir sağ olaydı, bu azadə qa-*

*dınları görəydi*. S.S.Axundov. // *İs. mənasında*. Azad adam. *Mahiyyətini həqir sanma; Azadələri əsir sanma!* M.Ə.Sabir. // Zərf mənasında. *İstərdim o da mən kimi bir hörmətə çatsın; Azadə dolansın.* M.Ə.Sabir. *Az müddətdə bu qızı ağıl-kamalının səbəbinə müəllimləri nəhayətdə sevirdilər; 15 yaşında firəng və rus dilində azadə danışırdı.* N.Nərimanov. *Tovuz kimi azadə gəzirsən bu çəməndə.* Ə.Vahid.

**AZADƏLİK** b a x **azadlıq** 1-ci mənada. *Dünyada eşq dərdini huşyar olan bilir; Azadəlik səfasını bidar olan bilir.* S.Ə.Şirvani. *İstəyirəm gərçi mən azadəlik; Zənciri amma bacarıb açmaram.* A.Səhhət. [Mirzə:] *Qaranlıqda qalanların işıq arzusunda, əsarətdə, zindanda qalanların azadəlik arzusunda olmaları təbiidir*. Ə.Haqverdiyev.

**AZADFİKİRLİ** *sif.* Azad düşünən, müstəqil düşünən. *Doktor hələ çar zamanı Rusiyadan Təbrizə və oradan da Tehrana mühacirət etmiş azadfikirli həkim idi.* M.İbrahimov.

**AZADFİKİRLİLİK** *is*. Azad düşünən, müstəqil düşünən adamın dünya görüşü, məsləki. *İntibah dövründə görkəmli alimlər, filosoflar, yazıçılar azadfikirlilik mövqeyindən çıxış etmişlər.*

**AZADXAH** [*fars.*] b a x **azadixah**. *Başqa bir azadxahı həbsxanada o qədər döydülər ki, oradaca öldü.* P.Makulu.

**AZADXAHLIQ** *is.* Azadlıq istəmə, hürriyyətpərvərlik. [Hücrə sahibi:] *Bu, azadxahlıq naminə yaraşan iş deyil*. P.Makulu.

**AZAD(İ)XAH** *sif.* [*fars.*] *köhn.* Azadlıq istəyən, azadlıq yolunda mübarizə edən; hürriyyətçi. *Mirzə Yusif xan keçən məktubunda müxtəsər olaraq yazmışdı ki, azadixah şahzadə Cəlaləddin Mirzə hal-hazırda xəstədir.* M.F.Axundzadə. *Şücaüddövləmələnun əsrində Təbrizdə rus hökuməti* [Siqəti-İslamı] *qeyri bir neçə azadixah mücahidlər ilə bir yerdə dar ağacından asdırıb edam etdirdi.* C.Məmmədquluzadə. *Belə bir vəziyyətdə ölkənin azadixah və demokratik düşüncəli adamları oturub gözləyə bilməzdi*. M.İbrahimov.

**AZADİYYƏT** [*fars.* azad və *ər.* ...iyyət] b a x **azadlıq** 1-ci mənada. *Sənin torpağın xarabdır və əhlin nadandır və sivilizasionicahandan bixəbərdir və azadiyyətdən məhrumdur.* M.F.Axundzadə. [Rzaqulu xan] *kəndlilər içində azadiyyət sözləri danışdığı üçün başqa kənd sahibləri tərəfindən mənfur sayılırdı*. M.S.Ordubadi.

**AZADLIQ** *is*. 1. Hər hansı bir sinfin, yaxud bütün cəmiyyətin və ya onun üzvlərinin ictimai-siyasi həyatına və fəaliyyətinə mane olan sıxıntı və məhrumiyyətlərin olmadığı hal; müstəqillik. *Siyasi azadlıq. Demokratik azadlıq. Azadlıq həsrəti ilə yaşayanlar.* – *Nədir üzündəki o aydın səhər; Azadlıq, qurtuluş onda gülümsər.* S.Vurğun. *Azadlıq ağacı şəhid qanıyla suvarılmadıqca bar verməz.* Xiyabani.

2. Ümumiyyətlə, bir şeydə ya hərəkətdə heç bir məhdudiyyət və sıxıntının olmaması; sərbəstlik. *Uşaqlara daha çox azadlıq vermək lazımdır. Hərəkət azadlığı. Ticarət azadlığı. İnsan fəaliyyətinin azadlığı.*

**AZADLIQSEVƏN**, **AZADLIQSEVƏR** *sif.* Azadlığı sevən, müstəqil olmağa çalışan; istiqlaliyyət uğrunda mübarizə edən, hürriyyətpərvər. *Azadlıqsevən xalqlar.* – *..Bu gün .. azadlıqsevən bütün xalqlar sülh uğrunda mübarizə aparır.* Z.Xəlil.

**AZADMAYI**, **AZADMAHI** *is*. Cavan qızıl balıq.

**AZADPƏRVƏR** [*fars.*] b a x **azadlıqsevən, azadlıqsevər.**

**AZADPƏRVƏRLİK** *is*. Azadlıq sevmə. [C.Cabbarlı] *doğma xalqının mübarizə tarixini əfsanə və nağıllarını öyrənməyə, xalqın mənəvi qüdrətini, azadpərvərliyini öz əsərlərində əks etdirməyə çalışır.* M.Arif.

**AZALDILMA** “Azaldılmaq”dan *f.is.*

**AZALDILMAQ** *məch.* Az hala salınmaq, az edilmək, əskildilmək. *Xərclər xeyli azaldılmışdır. Vaxtı azaldılmaq.*

**AZALMA** “Azalmaq”dan *f.is.*

**AZALMAQ** *f.* Miqdarca, sayca, həcmcə və s. əskilmək, zəifləmək, çəkilmək, məhdudlaşmaq. *Çayın suyu azaldı. Təhlükə azaldı. Həcmi azalmaq. Çəkisi azalmaq. Sürəti azalmaq. Xərci azalmaq.* – *Yazırsan ki, iştaham azalıb, belə ki, sübh vaxtı bozbaş yeyəndə, axşam azanı deyiləndə kabab yeyi-*

*rəm.* C.Məmmədquluzadə. *Sel get-gedə azalmaqda, şırıltı kəsilməkdə idi.* Mir Cəlal.

**AZALTMA** "Azaltmaq"dan *f.is.*

**AZALTMAQ** *f.* Əskiltmək, az etmək, ixtisar etmək (miqdarca, sayca, həcmcə və s.). *Həcmini azaltmaq. Çəkisini azaltmaq. Xərcləri azaltmaq.* – [Cuma] *lampanın işığını azalt, – dedi.* Ə.Əbülhəsən.

**AZAN** *is.* [*ər.*] Müsəlmanları namaza çağırmaq üçün azançının səhər, günorta və axşamüstü minarədən ucadan oxuduğu təkbir. *Şəhəri bir qədər dolaşıb saat 12-də azan səsi eşitdim, bir qoca kişi .. azan oxuyurdu.* Ə.Haqverdiyev. *Məşədi Əhməd hər səhər tezdən evdən çıxar, bir də axşam azanı qayıdardı.* S.Hüseyn.

**AZANÇI** *is. din.* Azan oxuyan, azanverən. [Xortdan:] *Bəs necə olubdur ki, özünüz üçün bir xoşsövt azançı tapmayırsınız?* Ə.Haqverdiyev.

**AZANÇILIQ** *is. din.* Azançı sənəti.

**AZANVERƏN** b a x **azançı.**

**AZAR** *is.* [*fars.*] 1. Xəstəlik, naxoşluq. [Ağakərim xan:] *..Mən heç ömrümdə azar çəkməmişəm, pamazı paltarım olur həmişə qalın..* N.Vəzirov. [Həkim:] *..Ciddi müalicə edilsə, ümid var ki, azar rəf olar.* Ə.Haqverdiyev. ◻ **Azar gəzmək** – yoluxma xəstəliyi düşmək, yayılmaq, sirayət etmək. **Azar tutmaq** – azarlamaq, xəstəlik tutmaq, xəstələnmək. **Azara düşmək** – xəstələnmək, naxoşlamaq. **Azara salmaq** – birisini xəstələndirmək, azara düşməsinə səbəb olmaq. *Bir tərəfdən ticarət işlərinin getdikcə dolaşıb zərər gətirməsi, digər tərəfdən də evinin nizamsızlığı Hacı Nəsiri azara salıb mum kimi əridirdi.* S.S.Axundov. **Azardan qalxmaq** – yenicə sağalmaq, xəstəlikdən durmaq. **Uzun azar** *dan.* – vərəm.

2. Əziyyət, əzab. *Neyləsin yarın cəfasın çəkməyən aşiq müdam; Çünki yar istər həmişə aşiqin azarını.* Nəsimi. *Bəs neyləsin indi bu dili-zar; Gör kimlər ilə çəkərdim azar.* X.Natəvan. *Gülzarda bülbülə tikəndir azar.* S.Ə.Şirvani. ◻ **Azar vermək (etmək)** – incitmək, əziyyət vermək, narahat etmək. *Öz aşiqi-zarinə gül azar etməz.* S.Ə.Şirvani. [Yoldaşları Fərmana deyirlər:] *Qardaş, bir qız yolunda özünə bir belə əziyyət, azar verməyin igid sifəti deyil.* Ə.Haqverdiyev. **Azarını çəkmək** – başqasının əvəzində əziyyət çəkmək, zərər çəkmək.

3. *məc. dan.* Bəhanə, ürəyindən keçən arzu, məqsəd. *Onun azarını mən yaxşı bilirəm. – Qədirin Musa kişiyə də, onun dəyirmanına da bərk azarı var idi.* İ.Əfəndiyev. *Ancaq* [Habil] *Bəxti ilə yol yoldaşı olmaq, .. dörd-beş düyəni haradan olsa da tapıb vermək və onun azarını üzünə demək istəyirdi.* S.Rəhimov. // *məc.* Xasiyyət, təbiət, adət, təmayül. *Dava eləmək onun azarıdır. – Tükəzban xalanın qızlığından bir azarı vardı ki, indiyəcən başından çıxmamışdı.* B.Talıblı.

◊ **Azarı qalxmaq (tutmaq)** *məc.* – tərk etdiyi adətə təzədən başlamaq, təzədən pis işə başlamaq.

**AZAR-BEZAR** *is. dan.* Hər cür azar, xəstəlik. *Muzdur Məşədi Əsgər iyirmi səkkiz ilin ərzində su ilə od arasında bişib bərkidikdə əsla azar-bezar bilməzdi.* S.M.Qənizadə. *Belə yerdə daha azar-bezar da yaddan çıxar.* Mir Cəlal. ◻ **Azar-bezar gəzmək** – b a x **azar gəzmək** ("**azar**"da).

**AZARGƏZDİRƏN** *sif.* 1. Xəstəlik yayılmasına səbəb olan, xəstəlik mənbəyi olan, mikrobları yayan. *Azargəzdirən milçəklər.*

2. *sif. məh.* Həmişə xəstə olan.

**AZARXANA** *is.* [*fars.*] *köhn.* Xəstəxana. [Hacı Fərəc:] *Zəhmət olmasa bir yerdə gedək, o bədbəxt oğlunu azarxanadan alıb, aparıb verək anasına, yazıqdır.* N.Vəzirov.

**AZARKEŞ** *is.* və *sif.* [*fars.*] *məh.* İdman həvəskarı. *Futbol azarkeşləri. – "Azarkeşlər" içində yenə bir həyəcan var.* M.Rahim. *Bəlkə də azarkeş oxucularım; Şəklimi axtarır, şəklimi gəzir.* M.Araz.

**AZARLAMA** "Azarlamaq"dan *f.is.*

**AZARLAMAQ** *f.* Xəstələnmək, naxoşlamaq. *Azarladım ölmədim, üzüldüm öldüm.* (Ata. sözü). *Xalam azarlamışdı. Hacı Mirzə Səttar həkimi gətirmişdilər ki, baxsın və müalicə eləsin.* C.Məmmədquluzadə.

**AZARLATMA** "Azarlatmaq"dan *f.is.*

**AZARLATMAQ** *f.* Xəstələndirmək, xəstəliyə salmaq, azarlamasına səbəb olmaq. *Uşağı soyuğa verib azarlatmaq.*

**AZARLI** *sif.* və *is.* Xəstə, azara düşmüş. *Azarlı uşaq. – Azarlı da öz yerində uzan-*

*mışdı və bir söz danışmırdı.* C.Məmmədquluzadə. *Azarlı qızdırmanın yüksək dərəcəsindən yatağın içində çapalayıb əziyyət çəkirdi.* B.Talıblı.

**AZARLIXANA** *is. köhn.* Xəstəxana. [Usta:] *Məni götürüb apardılar azarlıxanaya. Bir-iki ay orada qaldım ki, yaxşı olum.* Çəmənzəminli.

**AZARLILIQ** *is.* Azarlı adamın vəziyyəti, halı.

**AZARSIZ** *sif.* Əziyyətsiz, əzabsız, zəhmətsiz, asan. *Azarsız iş. Bu iş azarsız* (z.) *başa gəlməz.*

**AZAY** *is. məh.* Şikayət, deyinmə, gileylənmə; giley.

**AZAYLANMAQ** *f. məh.* Şikayətlənmək, deyinmək, gileylənmək. [Ağsaqqallardan biri:] *..Kərbəlayı, bizim də məqsədimizdə elə sənsən. Yoxsa Safo azaylansa da, bu qohumluqdan içi gülür.* S.Rəhimov.

**AZCA** *sif.* və *zərf* Azacıq, bir az. *Azca pul. Azca gəzmək. Azca yatmaq. – Azca keçməmiş onun* [Musanın] *ayaq səsləri qaranlıq və sakit payız küçəsinin qoynunda itib getdi.* M.İbrahimov. *Bir azdan günəşlə üfüq arasında azca məsafə qaldı.* S.Rəhman. *Azca* (is.)*, hara gedirsən? Çoxca yanına.* (Ata. sözü).

**AZCA-AZCA** *zərf* 1. Hamısını birdən yox, az-az. *Bu sudan azca-azca əlimə tök.*

2. Yavaş-yavaş. *Uşaq azca-azca yeriyir.*

**AZCANA** *dan.* b a x **azacıq.**

**AZ-ÇOX** *zərf* Bir miqdar, bir qədər, hər bir miqdarda olursa olsun. *Az-çox məlumatı olmaq. Az-çox iş görmək.* – [Bəkir:] *Bu yerlərə mən az-çox bələdəm.* N.Vəzirov. [Haşım] *axır vaxtlarda az-çox dülgərlik sənətini öyrənmiş və qazandığı paranın yarısını ata-anasına göndərirdi.* B.Talıblı.

**AZDAN-ÇOXDAN** b a x **az-çox**. [Qasım kişi:] *Axı mən də bir qoca kişiyəm, dünyada mən də azdan-çoxdan yaxşı ilə yamanı seçirəm.* C.Məmmədquluzadə. [Ağa Kərim xan:] *Cehizi yoxdur? Gənə azdan-çoxdan, bir şey.* N.Vəzirov. *Bəlkə gənclərdir, azdan-çoxdan mənim yazı-pozumdan oxuyublar, həvəslənirlər? – deyə düşündüm.* S.Rəhimov.

**AZDANIŞAN** *sif.* Danışmağı, söhbət etməyi sevməyən. *Azdanışan adam. – Qumru çox azdanışan bir arvad idi.* Ə.Əbülhəsən.

**AZDIRILMA** "Azdırılmaq"dan *f.is.*

**AZDIRILMAQ** *məch.* 1. Yoldan çıxarılmaq, sapdırılmaq, yayındırılmaq.

2. İtkin salınmaq, uzaqlaşdırılmaq, rədd edilmək.

3. Korlanmaq, pis öyrədilmək, ərköyün öyrədilmək.

**AZDIRMA** "Azdırmaq"dan *f.is.*

**AZDIRMAQ** *f.* 1. İtkin salmaq, evdən uzaqlaşdırmaq, rədd etmək. *İti azdırmaq. Pişiyi azdırmaq.*

2. Düz yoldan çıxarmaq, yanlış istiqamətə yönəltmək, pis yola sövq etmək. *Atalar doğru deyiblər ki, dövlət adamı azdırar.* İ.Musabəyov. // *məc.* Qəsdən sapdırmaq, fikrini yayındırmaq, çaşdırmaq. *Yenə bir para ata-analarına lənət olmuşlar başlayıblar millətimizi çaşdırmağa, azdırmağa.* C.Məmmədquluzadə. [Tahir:] *Mənim fikrimi azdırma, mən cəbhəni demirəm. Oranın öz qayda-qanunu var.* M.Hüseyn.

3. Başqa tərəfə, başqa istiqamətə çevirmək, yönəltmək. *Əbəs göstərmə sən məscid təriqin Seyyidə, zahid; Onu azdırmaq olmaz bir dəxi meyxanə rahindən.* S.Ə.Şirvani. *Bəziləri paya kəsib hazırlayır, çayın içinə salınmış iri daşların dalına sancıb şəl basır, çayın ağzını əkinlərin üzərindən azdırırdılar.* Ə.Vəliyev.

4. *məc.* Arzu edilməyən bir şəxsdən yaxa qurtarmaq üçün onu cürbəcür vasitələrlə özündən uzaqlaşdırmaq. *Hərifi azdır getsin, qulağımızı apardı.*

5. Korlamaq, pis öyrətmək, ərköyün öyrətmək, qudurtmaq. *Uşağı azdırmışsınız, sözə də baxmır.*

6. Bir sıra isimlərə qoşularaq müxtəlif ifadələr və mürəkkəb feillər düzəldilir; məs.: ağlını azdırmaq, danışığını azdırmaq, iz azdırmaq.

**AZDIRTMAQ** *icb.* Başqası vasitəsilə azdırmaq.

**AZƏR**[1] b a x **azərbaycanlı.**

◊ **Azər övladı** *tənt.* – azərbaycanlılar. *Azər övladı vətənsiz yaşamaz; Tut əlimdən ki, mənəm arxa sənə.* S.Rüstəm. *Doğma qardaş kimi azər övladı; Misirdə özünü biganə sanmaz!* Aşıq Hüseyn.

**AZƏR**[2] *is.* [*fars.*] Oda xidmət göstərən mələk.

**AZƏR**[3] *is.* [*fars.*] İranda günəş təqvimində ilin 9-cu ayı (22 noyabr – 21 dekabr).

**AZƏRBAYCANCA** *sif.* və *zərf* Azərbaycan dilində. *Azərbaycanca yazıb-oxumaq. Azərbaycanca qəzet.* – [Nizami:] *Sizə də, bizə də məlumdur ki, Şirvan sarayında yaşayanlar da, xaqanın özü də azərbaycanca danışa bilmirlər.* M.S.Ordubadi. *Yaralı azərbaycanca danışırdı.* Ə.Vəliyev.

**AZƏRBAYCANÇILIQ** *is.* Azərbaycan xalqının vahid fikir ətrafında mənəvi birliyini nəzərdə tutan milli ideya. *Azərbaycançılıq haqqında düşüncələr. Azərbaycançılıq amalı.*

**AZƏRBAYCANLI** *is.* Azərbaycan Respublikasının və Cənubi Azərbaycanın əsas əhalisini təşkil edən, türk dillərindən birində danışan xalq və bu xalqa mənsub adam. *Dünya azərbaycanlıları. Cəmiyyət xarici ölkələrdə yaşayan azərbaycanlılarla mədəni əlaqə saxlayır. Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir. – ..Sonralar azərbaycanlılar da bu yolda çalışmağa başlayırlar.* Çəmənzəminli. *Atabəy Məhəmməd azərbaycanlıları, xüsusən aranlıları səfərbərliyə alaraq Təbrizlə Marağanı qurtarmaq üçün uzunmüddətli bir müharibə təşkil etmişdi.* M.S.Ordubadi. // Sif. mənasında. *Azərbaycanlı şair və ədiblər. Azərbaycanlı Nizami dünya ədəbiyyatının fəxri, bəzəyidir.*

**AZƏRBAYCANŞÜNASLIQ** *is.* Azərbaycanın tarixini, mədəniyyətini, dilini və s. öyrənməklə məşğul olan elmlərin məcmusu. *Azərbaycanşünaslığın bir çox mühüm problemlərinin həlli birbaşa arxeoloji axtarışlarla bağlıdır.*

**AZƏRİ** *is.* Azərbaycanlı. *Azərilər haqqında Yaqut Həməvinin rəyi şayani-diqqətdir..* Çəmənzəminli. *Azəridir mənim adım; Füzulidir söz ustadım.* S.Vurğun. // *sif.* Azərbaycana, azərbaycanlılara, yaxud Azərbaycan dilinə aid. *Azəri mülkünü bütün gəz, dolan; Qalmasın görməmiş bir adam səni.* H.K.Sanılı.

**AZƏRİCƏ** b a x **azərbaycanca.**

**AZGÜCLÜ** *sif.* Qüvvəsi az olan, zəif. *Neft mədənində çoxgüclü elektrik mühərrikləri azgüclü mühərriklərlə əvəz edilmişdir.*

**AZĞIN** *sif.* 1. Azmış, yolunu itirmiş. ◻**Azğın düşmək** – yolunu itirmək, yurdundan, məskənindən avara düşmək. // *məc.* Yoldan çıxmaq, pis yola düşmək.

2. *məc.* Qudurmuş, vəhşi, yırtıcı, amansız, önüalınmaz, sərt, şiddətli. *Azğın küləklərlə gəlib üz-üzə: Gah batdım dənizə, gah çıxdım üzə.* H.Cavid. // İs. mənasında. *Burada at çapdı keçən azğınlar.* S.Vurğun. // Qudurğan, lovğa, təkəbbürlü.

3. Pozğun, namussuz. [Qohumlar] *ata-ananı namussuz adlandırdılar, qıza azğın dedilər.* Mir Cəlal.

**AZĞINLAŞMA** "Azğınlaşmaq"dan *f.is.*

**AZĞINLAŞMAQ** *f.* Qudurmaq, yolundan çıxmaq, öz hərəkətlərində heç bir hədd-hüdud bilməmək; vəhşiləşmək.

**AZĞINLIQ** *is.* Vəhşilik, sərtlik, amansızlıq; qəzəb və hiddət, başlı-başınalıq. *Düşmənin azğınlığı. Azğınlıq etmək.* // Qudurğanlıq, lovğalıq, təkəbbürlük.

**AZI**[1]: **azı dişlər** – ağzın hər iki tərəfində altda və üstdə olub, yeyilən şeyi çeynəməyə məxsus dişlər. *Serjant sevindi və azı dişləri görünənədək ağzını ayırdı.* P.Makulu.

**AZI**[2] *zərf* Ən az, ən cüzi; minimum. *Bu şeyi almaq üçün azı 5 manat lazımdır.* – [Əhməd:] *Ay kişilər, .. bu saat Səfər bəy ilə nökəri Qənbər at üstə gedirdilər; azı yarım verst onları güdmüşəm.* B.Talıblı.

**AZIDİŞİ** *is.* b a x **azı**[1].

**AZIXANTROP** *is.* Azıx mağarasında (Azərbaycan Respublikasında) alt çənə sümüyünün bir hissəsi tapılmış ibtidai insana verilən ad. *Azıxantrop ilk paleontropa keçid pilləsini təşkil edir.*

**AZIXMAQ** b a x **azmaq** 2-ci mənada.

**AZIQ, AZUĞ** *is. qəd.* Azuqə. *Yedi günlük azuğla çıqayın.* "Dədə Qorqud".

**AZIŞDIRMAQ** *f.* 1. B a x **azdırmaq**.

2. Pozmaq, sağalmaq üzrə olan xəstəliyi və ya yaranı əlləşdirib təzələmək.

**AZIŞMAQ** *f.* 1. Yolunu azmaq, düz yoldan kənara çıxmaq. [Şəhrəbanı xanım:] *Gülçöhrə .. Allahı sevirsən, ağlına zor vermə, sən lap azışıbsan, get işinə.* M.F.Axundzadə.

2. Təzələnmək (yara, xəstəlik).

**AZITMAQ** b a x **azdırmaq** 1-ci mənada.

**AZİM** [*ər.*]: **azim olmaq** *klas.* – getmək, üz tutmaq. *Culfa yolu ilə Təbrizdən keçib, Nəcəfüləşrəf şəhərinə azim olacaq.* C.Məmmədquluzadə.

**ÁZİMUT** [*ər.* "əssimut" sözündən] *astr. geod.* Bir meridian müstəvisi ilə müşahidə edilən göy cismindən (yaxud müşahidə edilən şey içərisindən) keçən vertikal müstəvi arasında olub göy cisimlərinin vəziyyətini təyin edən bucaq.

**AZİŞLƏNƏN** *sif.* Çox işlənməyən, az tətbiq olunan, az yayılmış. *Azişlənən mallar. Azişlənən söz.*

**AZQANLI** *sif. tib.* Qanı az olan, solğun (adam).

**AZQANLILIQ** *is. tib.* Çoxlu qan itirmək və ya qanda qırmızı cisimciklərin (hemoqlobin) azlığı nəticəsində əmələ gələn xəstəlik hal.

**AZLIQ** *is.* 1. Hər hansı bir qrupun (adamlar qrupunun) az hissəsi; sayca az olan hissə; əqəliyyət. *Azlıqda qalmaq. Layihəyə ancaq azlıq səs vermədi.* – [Uğur:] *Bizdə azlıq çoxluğa tabedir.* İ.Əfəndiyev.

2. Miqdarca, sayca, müddətcə və s. kifayətsizlik, çatışmazlıq. *Vəsait azlığı. Material azlığı. Vaxtın azlığı. İxtisaslı işçilərin azlığı. – Şəmsi yenə vaxtın azlığını xatırlayıb söhbətə yekun vurmağa çalışdı.* M.Hüseyn. *Bu isə yenə ona* [Quliyevə] *etimadın azlığını göstərirdi.* Ə.Sadıq. ☐ **Azlıq etmək** – çatışmamaq, kifayət etməmək, ehtiyacı ödəməmək, təmin etməmək. *Haşım hərçənd öz vətəninə qayıtmaq istəyirdi, amma bir ilin muzd pulu ona azlıq edirdi.* B.Talıblı. *Taxıldöyən maşın, vəl azlıq eləyirdi.* Mir Cəlal.

**AZMA** "Azmaq"dan *f.is.*

**AZMAQ** *f.* 1. Yolu itirmək, istiqaməti itirmək. *Meşədə azmaq. Atlılar yolu azdılar.* – [Həkim:] *Axı necə oldu ki, belə sağlam və qüvvətli adam olduğunuz halda, birdən azdınız və evinizin yerini itirdiniz?* C.Cabbarlı. *Kənardan baxana elə gəlirdi ki, bu maşın azıb, yoldan çıxmışdır.* Mir Cəlal. *İndi yay günü Mil düzün(də) .. azan yolçunun susuzluqdan qorxusu yoxdur.* İ.Əfəndiyev.

2. Doğru yoldan çıxmaq, yanılmaq, sapmaq. [Şəhrəbanı xanım:] *Çox yaxşı, sən azıbsan; yolundan, izindən çıxıbsan, get!* M.F.Axundzadə. *Sən azma sədaqət yolunu, sevgili qardaş!* C.Cabbarlı.

3. *məc.* Coşmaq, qudurmaq, həddini aşmaq, şiddət göstərmək. *Sən lap azmısan ha!* – [Ağ zanbaq:] *Gərçi uzundursa mənim yarpağım; Yoxdu yenə lovğalığım, azmağım.* A.Səhhət.

◊ **Ağlı azmaq** – b a x **ağıl**[1]. **Əməli azmaq** – b a x **əməl**. **Hər yol(un)dan azan** – hər bir adam, hər ötən, hər kəs, hər yetən. [Arvad:] *Sən də hər yoldan azanı evə buraxırsan.* S.Rəhimov. **Kəkliyi azmaq** – b a x **kəklik**. **Nə iti(m) azıb** – "nə işi(m) var, getməz, getmərəm" mənasında. [Şəhrəbanı xanım:] *Firəngdə onun nə alıb-verəcəyi var, Parijdə onun nə iti azıbdır?* M.F.Axundzadə. [Zeynəb xanım:] *Mənim elə yerlərdə nə itim azıb?* Mir Cəlal.

**AZMAN** *sif.* Çox böyük, çox iri, çox yekə, əzəmətli, heybətli. *Azman tikinti. Azman binalar. Azman qayalar. – Saçı-saqqalı ağarmış qocaman buruq ustalarının belə azman yanğın gördükləri yadlarına gəlmir..* Ə.Məmmədxanlı.

**AZMANLIQ** *is.* Çox irilik, çox böyüklük, əzəmət.

**AZ-MAZ** *zərf dan.* Bir az, az miqdarda, cüzi; zəif. *O, farsca az-maz bilir. Bu işdən az-maz başım çıxır. Az-maz yemək yedim.* – [Seryoja:] *Bu şeyləri az-maz mən də bilirəm.* A.Şaiq.

**AZMIŞ** *f.sif.* 1. Yolunu itirmiş, istiqamətini itirmiş. [Durna] *özünü azmış .. adamlar kimi ümidsiz və tək hiss etdi.* İ.Əfəndiyev. *Kosa zülmətdə azmış yolçular kimi hər tərəfə yol axtarır və tapa bilmirdi.* S.Rəhimov. // *məc.* Doğru yoldan çıxmış, yanılmış, sapmış. *Azmışlar üçün elmü ədəb nuri-səhərdir.* M.Hadi.

2. *məc.* Coşmuş, qudurmuş, həddini aşmış; azğın.

**AZÓT** [*yun.*] *kim.* Havanın əsas tərkib hissəsini təşkil edən maddələrdən birisi – rəngsiz və qoxusuz qaz; kimyəvi element. *Astara yaxınlığındakı mineral bulaqlardan da su ilə bərabər azot qazı çıxır.* M.Qaşqay.

**AZOTLAŞDIRILMA** "Azotlaşdırılmaq"-dan *f.is.*

**AZOTLAŞDIRILMAQ** *məch.* Azotla, azotlu maddələrlə zənginləşdirilmək.

**AZOTLAŞDIRMA** "Azotlaşdırmaq"dan *f.is.*

**AZOTLAŞDIRMAQ** *f. xüs.* Bir şeyin tərkibini azotlu maddələrlə zənginləşdirmək,

bir şeydə azotlu maddələrin miqdarını artırmaq. *Torpağı azotlaşdırmaq*.

**AZOTLU** *sif. kim.* Tərkibində azot olan. *Azotlu birləşmələr. – Balaca daxmacaların birində azotlu və fosforlu gübrələr .. görünürdü.* Ə.Vəliyev.

**AZOTSUZ** *sif. kim.* Tərkibində azot olmayan. *Azotsuz maddələr. – Çörəyə azotsuz deməkdən murad o deyil ki, onun azotu yoxdur, onun azotu var və çoxdur da. Amma nişastası artıq olduğuna* (*görə*) *ona azotsuz .. deyilir.* H.Zərdabi.

**AZTAPILAN** *sif.* Nadir, bol olmayan, az-az təsadüf edilən, əldə edilməsi çətin olan, satışda az olan. *Aztapılan mallar. Aztapılan şey.*

**AZTUTUMLU** *sif.* Az şey tutan, tutumu az olan, həcmcə kiçik. *Aztutumlu qab.*

**AZUQƏ** *is.* Qida ehtiyatı, ərzaq ehtiyatı. *Azuqə ilə təmin etmək. – Kəndlilər taxıllarını biçib döymüş, ev üçün azuqə saxlayıb, yerdə qalanını satıb nəqd pul etmişlər..* S.S.Axundov. *Səriyyə xala və Gülnaz .. evin içini səliqəyə salıb, qış azuqəsini yerbəyer etmiş, həyətə çıxmışdılar.* M.İbrahimov. *Bu halda Almaz qucağında qəzetə bükülü azuqə içəri girdi.* Mir Cəlal.

**AZUŞAQLI** *sif.* Uşaqları az olan. *Azuşaqlı ana* (ailə). *Azuşaqlılardan* (is.) *alınan vergi.*

**AZÜRDƏ** *sif.* [*fars.*] *klas.* İncimiş, əziyyət çəkmiş, əzab çəkmiş. ◻ **Azürdə etmək** – incitmək, məyus etmək, kədərləndirmək. *Bağışla cürmümü, ey şux, kim həyatımda; Çox etmişəm səni azürdə ahü zarım ilə.* Q.Zakir.

**AZYARPAQ** *sif. bot.* Yarpaqları az və ya seyrək olan.

**AZYAŞLI** 1. *sif.* Yaşı az olan, kiçik. *Azyaşlı uşaq. – Fəhləliyə gedən azyaşlı uşaqlara xozeyinləri heç bir zaman istirahət günü verməzdilər*. H.Sarabski.

2. *is*. Kiçik uşaq (oğlan, ya qız). *Azyaşlılara məxsus oyuncaq.*

# Bb

**B** Azərbaycan əlifbasının ikinci hərfi. bax **be.**

**BA** *nida*. 1. Heyrət və təəccüb bildirir, yaxud birdən bir şey yada düşdükdə deyilir. *Ba! Sən hara, bura hara! Ba! Bu haradan çıxdı?* – [Ağa Kərim:] *Ba! Bir adam fikrimə düşdü, əgər razı ola.* M.F.Axundzadə. // Bəzən söylənilən bir şeyi dinləyənə təsdiq etdirmək üçün sual yerində işlənir – doğrudanmı? doğrumu? *Bu gün ölməmiş ölümdən qurtardım. – Ba? – Nə xəbər var, Məşədi? – Sağlığın. – Az, çox da yenə? – Qəzet almış Hacı Əhməd də. – Ba! Oğlan, nə mənə?* M.Ə.Sabir.

**ba, bə.** Təkrardan ibarət olan mürəkkəb sözlərdə bitişdirici ünsür; məs.: adbaad, qapıbaqapı, qolbaqol, şəhərbəşəhər, kəndbəkənd və i.a.

**BAB**[1] *is*. [*ər.*] *köhn.* 1. Bir kitab mətninin bölündüyü hissələrindən hər biri (çox vaxt hər bab bir neçə fəslə bölünür). *Gülüstani-səri-kuyin kitabın bab-bab, ey gül; Xətti-reyhan ilə cədvəl çəkib, gülzarə yazmışlar.* Füzuli.

2. *tənt.* Qapı, girəcək; böyük qapı. *Məktəb nə demək? Ümmətə bir babi-səadət*. M.Hadi.

3. Yerlik halında: **...babda (...babında)** *köhn.* – ...barədə, ...xüsusunda, ...cəhətdən. *Gəl Nəbatinin sidqi-kizbini; Sən bu babdə eylə imtahan.* Nəbati. *Vəzir, indi görərsən ki, sənin xanın da bu babda xüləfalardan və Sultan Mahmud Qəznəvidən əskik deyil.* M.F.Axundzadə.

**BAB**[2] *is*. [*fars.*] Tay, cur, bərabər. *Məxmərin abı gərək; Yar yarın babı gərək.* (Bayatı). *..Məndən əfzəldi qüvvədə qəssab; Qızını ver ona, odur sənə bab*. S.Ə.Şirvani. *Heç kəs bu toya bir söz deyə bilmədi, çünki hər iki cavan tamamilə bir-birinin babı idi.* S.Rəhimov. // Uyğun, münasib, müvafiq, yaraşan. *Hər işini bab elə, görən desin, ha belə.* (Ata. sözü).

**BAB**[3] bax **babi.** [Seyidsədulla:] *Siz bab və bəhailik aləmi barəsində uzun və uzadı mütaliə etməlisiniz.* M.S.Ordubadi.

**BABA** *is*. 1. Atanın, ya ananın atası; nəvəsi olan kişi.

2. Bəzi yerlərdə ataya deyilir.

3. Yaşlı və hörmətli kişi, yaxud yaşlı kişiyə hörmətlə müraciət. *Durub cütçü baba öpdü alnımdan; Bildim ki, mehriban olurmuş insan.* S.Vurğun. // Çox qoca kişi mənasında.

4. Bəzən xitab yerində işlənir. *Baba, məndən nə istəyirsən? – Uşaq mənimdir, baba! Dəxli nədir sizlərə?* M.Ə.Sabir.

5. Sadə, adi, fağır mənasında (adətən təvazö üçün peşə, sənət bildirən sözlərə qoşulur). [Yusif Sərrac:] *Mən bir fağır sərrac babayam. Mən hara, taxtü tac hara?!* M.F.Axundzadə. *Cütçü babasan, buğdanı ver, darı yeyərsən; Su olmasa, qışda əridib qarı yeyərsən.* M.Ə.Sabir. [Mirzə:] *Mən yoxsul bir müəllim babayam.* Ə.Haqverdiyev.

6. Yalnız cəm şəklində: **babalar** – əcdad. [Alan padşahlarının] *babalarından biri Abbasilər xilafətinin birinci əsrində Nəsara* (*xristian*) *dinini qəbul etdi.* A.Bakıxanov. *Seyrə vardıqda o heçlikləri mən; Deyirəm: torpağa dönmüş babalar..* S.Vurğun. ☐ **Ulu baba** – nəslin banisi, ilk ağsaqqalı.

**BABACAN** *is.* Babaya, yaxud qoca kişiyə mehribanlıqla müraciət. *Babacan, bir az oturub dincinizi alın.* // Ataya müraciət. *Kişi ağlar gözilə qıldı fəğan; Söylədi oğlu: – Ağlama, babacan!* M.Ə.Sabir.

**BABADANQALMA** *sif.* 1. İrs, miras. *Babadanqalma ev.*

2. *məc.* Çox köhnə, qədim, vaxtı keçmiş. *Babadanqalma üsullarla işləmək olmaz.*

**BABAL** bax **vəbal.** *Dərin bir dəryadır şair xəyalı; Götürdüm boynuma şəri, babalı.* R.Rza.

**BABALIQ** *is.* 1. Ögey baba.

2. Babanın nəvələri üzərindəki haqqı. // Baba ilə nəvəsi arasındakı qan qohumluğu.

**BABASİL** *is.* [*ər.*] *tib.* Düzbağırsağın aşağı hissəsindəki qan damarlarının şişməsi nəticəsində tez-tez qanayan düyünlərin əmələ gəlməsindən ibarət xəstəlik. *Babasil, düzbağırsaq venalarında qan durğunluğundan irəli gəlir.*

**BABASİLLİ** *sif.* Babasil xəstəliyi olan.

**BABAT** *sif.* və *zərf* Orta keyfiyyətli, miyanə, orta həddə yaxın, nə çox yaxşı, nə də çox pis. *Babat şey.* – [Cavad bəy:] *Ruzgarım bir növ babat keçir, hacı.* N.Vəzirov. [Pərinin] *əlahiddə bir gözəlliyi də yox idi, amma beləcə babat idi.* C.Məmmədquluzadə. *Az zamanda babat bir kitabxana yarandı.* Ə.Sadıq.

**BABATCA** *zərf* bax **babat.**

**BABATLAŞDIRILMA** "Babatlaşdırılmaq"-dan *f.is.*

**BABATLAŞDIRILMAQ** *məch.* Babat hala salınmaq, bir qədər yaxşılaşdırılmaq.

**BABATLAŞDIRMA** "Babatlaşdırmaq"-dan *f.is.*

**BABATLAŞDIRMAQ** *f.* Bir qədər yaxşılaşdırmaq.

**BABATLAŞMA** "Babatlaşmaq"dan *f.is.*

**BABATLAŞMAQ** *f.* 1. Babat olmaq, bir qədər yaxşılaşmaq, bir qədər düzəlmək. [Alo:] *Bircə bu ala öküzə bir tay tapsaydıq, .. işimiz onda bir ala-qolay babatlaşardı.* S.Rəhimov.

2. Yaxşılaşmaq, sağalmaq, aynımaq. *Xəstə iki gündür ki, babatlaşıbdır.*

**BABATLIQ** *is.* Babat şeyin halı.

**BABAY** *is.* Uşaq dilində: qoca, saqqallı kişi (adətən balaca uşaqları qorxutmaq üçün söylənir).

**BABAYİ-ƏMİR** *is.* [*xüs. is.*-dən] Çoxbilmiş, söz altında qalmayan adam.

**BABƏKİLƏR** *cəm* [*xüs. is.*-dən] *tar.* XI əsrdə Babəkin başçılığı ilə ərəb istilaçılarına qarşı mübarizə aparmış Babək tərəfdarları.

**BABƏT**[1] [*fars.*] bax **babat.**

**BABƏT**[2] [*fars.*] *köhn.* 1. Təhər, hal, vəziyyət, keyfiyyət. *Zülf bir yana düşər, gərdən bir yana; Özün bilməz, bir özgə babət olur.* M.P.Vaqif.

2. Adətən yerlik və çıxışlıq halında – **...cəhətdən, ...barədə.** *Bəlkə öz-özünə düşünə ki, bu iş hər babətdən pis işdir.* C.Məmmədquluzadə. *Həm bu babətdə də biz məzuruq; Çünki biz tərbiyəyə məmuruq.* A.Səhhət. [Məşədi:] *Azdır, qiymət babətdən çox az verdin, bəy!* S.Rəhimov.

**BABİ, BABI** *is.* [*xüs. is.*-dən] 1. XIX əsrin ortasında İranda "Bab" təxəllüslü Mirzə Əli Məhəmməd tərəfindən təsis edilmiş dini təriqətə mənsub olan adam. *Dedilər ki, Təbrizdə çox babi var, amma heç kəs qorxusundan ləb tərpədə bilmir.* M.F.Axundzadə. *Burada ancaq babılar belə birçək qoyurlar.* P.Makulu.

2. *məc.* Dinsiz, imansız, kafir mənasında (keçmişdə mürtəce mövhumatçıların tərəqqipərvər ziyalılara təhqir üçün verdikləri ad). *Məsələn, mənə deyirlər ki, filankəs babidir, yəni mürtəddir.* C.Məmmədquluzadə. *Bu isə, bəs o ləinin də işi qullabıdır; Dini, imanı danıb, yoldan azıbdır, babıdır.* M.Ə.Sabir. [Mirzə Turab:] *Əlləşdim, vuruşdum, çox zəhmət çəkdim, amma siz yenə cəhalətdən əl götürmədiniz, ..* [mollalar] *mənə babı dedilər.* B.Talıblı.

**BABİLİK, BABILIQ** *is.* [*xüs. is.*-dən] 1. Babi məzhəbi; XIX əsrin ortalarında İranda "Bab" təxəllüslü Mirzə Əli Məhəmməd adlı bir şəxs tərəfindən təsis edilmiş dini təriqət. // Babi məzhəbinə mənsubiyyət.

2. *məc.* Dinsizlik, kafirlik mənasında.

**BABİLLİLƏR** *cəm, tar.* Qabaq Asiyada ən qədim (e.ə. V-I əsrlərdə) dövlətlərdən biri olan Babilistanın əhalisi.

**BABİZM** bax **babilik.**

**BABLAŞMA** "Bablaşmaq"dan *f.is.*

**BABLAŞMAQ** *f.* Bab olmaq, tay olmaq, uyğunlaşmaq.

**BAC** *is.* [*fars.*] *köhn.* 1. Keçmiş zamanlarda bir yerdən başqa bir yerə aparılan mal və sairədən alınan rüsum, vergi. *Koroğlu karvanın qabağını kəsdi, bac verməklərini söylədi.* "Koroğlu". // Ümumiyyətlə, vergi. // Məc. mənada. *klas. Ta ki ol ahu gözün mülki-Xütəndən bac alır.* Xətayi. *Səbzə gülə verdi müşk bacın; Gül səbzəyə mülkünün xəracın.* Füzuli.

2. *tar.* Qalibin məğlubdan aldığı təzminat, vergi. *Gəl sənə söyləyim, bazirganbaşı; Gəlmişəm səndən bac alam, gedəm.* "Koroğlu".

3. *məc.* İntiqam, qisas, əvəz çıxma. [Tərlan xanım:] *Zəmanəyə bax! İşə bir bax. Gör kim kimdən bac alır!* Mir Cəlal.

**BACA** *is.* 1. Tüstü çıxmaq üçün ocağın üstündə kərpicdən hörülən və ya dəmirdən qayrılan içi boş boru. *Evin bacası. Fabrik*

*bacası. – Buruq-buruq bacalardan çıxır tüstü, ağ duman.* A.Səhhət. *Gecədən xeyli keçmiş bacadan gumbultu ilə bir şey içəri düşdü.* S.S.Axundov. *Küçələrə baxan bacaların görünüşü də mənə, yaxın səhərin qorxulu dastanını oxuyurdu.* M.S.Ordubadi.

2. İşıq və hava gəlmək üçün bəzən kənd evlərinin və anbarların damında pəncərə əvəzinə qoyulan dəlik. *Tövlənin üst tərəfindəki iki baca qarın işığını, ayazın şaxtasını içəriyə buraxmır.* S.Rəhimov.

3. Su kəməri, lağım və s. bu kimi yeraltı qurğuları yoxlamaq üçün qoyulan örtülüb açılan dəlik, qapaq. ☐ **Baca açmaq** – dəlik açmaq, deşmək. *Top gülləsi evin divarında bir baca açdı.*

◊ **Bacadan düşmə** – 1) təsadüfən, gözlənilmədən, müftə, zəhmətsiz ələ keçən şey haqqında; tapıntı; 2) gözlənilmədiyi halda, birdən və qəflətən gələn adam haqqında.

**BACA-BACA** *is.* Köhnə məişətdə: Novruz bayramı axşamı qapı-qapı dolaşıb bayramlıq pay almaq adəti; qodu-qodu.

**BACAQ** *is.* Qıç. *Heyvancıqlar .. bacaqlarını bükərək, quyruqlarını oynada-oynada analarının məmələrini əmirdilər.* A.Şaiq.

**BACAQLI** *is. köhn.* Keçmişdə Hollandiya və ya Avstriya qızıl pulu (qadınlar bunları ipə düzərək bəzək kimi boyunlarına taxardılar). *Şəhrəbanı xanım sandıqçanın ağzını açır, yüz dənə təzə bacaqlı çıxardır.* M.F.Axundzadə. *Oğlan əlini cibinə salıb, qıza ya bir qızıl saat, ya sapoşka, ya bir bacaqlı, ya da ki üzük bağışlardı.* H.Sarabski. // Ümumiyyətlə, qızıl pul. [Qasid] *əmirdən şairə bir sandıq bacaqlı, bir məktub və bir gözüyaşlı əsir qız gətirmişdi.* Ə.Məmmədxanlı.

**BACALI** *sif.* Bacası, ya bacaları olan. *Bacalı ev.*

**BACALIQ** *is.* Damda baca üçün hazırlanmış yer.

**BACANAQ** *is.* Bacıların ərlərinin bir-birinə qohumluq münasibəti. *Nə olar ki, bacanaq bacanağın evinə getməsə, daha hara getmək olar?* S.Rəhimov. [Babaxanın] *dili güclə söz tutdu: – Yoldaş, o mənim bacanağımdır.* Mir Cəlal.

**BACARAN** *f.sif.* Qabiliyyətli, başı çıxan, iş görə bilən, əlindən iş gələn, bir işin öhdəsindən gələn. *Bacarana baş* (*can*) *qurban.* (Ata. sözü).

**BACARIQ** *is.* Bilik, təcrübə, vərdiş nəticəsində əldə edilmiş işgörmə qabiliyyəti, təcrübə. *Hər işdə bacarıq lazımdır. Onun heç bir bacarığı yoxdur. – İnsan öz səyi və bacarığı sayəsində istədiyi məqsədə nail ola bilər.* S.S.Axundov.

**BACARIQLI** *sif.* İstedadlı, qabiliyyətli, əlindən iş gələn, iş yaradan, təcrübəli. *Bacarıqlı adam. Bacarıqlı usta.*

**BACARIQLI(LI)Q** *is.* Bacarıqlı adamın xüsusiyyəti. *Hüseynqulunun mahirliyini və bacarıqlığını görən başqa bir tacir, onu öz yanında faytonçu durmağa dəvət edir.* H.Sarabski.

**BACARIQSIZ** *sif.* Bacarığı olmayan, əlindən iş gəlməyən, qabiliyyətsiz, təcrübəsiz, aciz. *Bacarıqsız adam.*

**BACARIQSIZLIQ** *is.* Bacarığı olmama, əlindən iş gəlməmə, qabiliyyətsizlik, təcrübəsizlik, acizlik. ..[Kor kişinin] *əlbisəsinin tərzi, biçimi – avamlığını; yerişi – gözsüzlüyünü; üzünün xətləri – aciz və bacarıqsızlığını andırırdı.* S.Hüseyn. *Sobadan düşən işıqda onun* [Mahmudun] *yoğun qara barmağı bacarıqsızlıqla* (z.) *iynəni sarı düymənin dibinə batırır*(*dı*). Ə.Əbülhəsən.

**BACARMA** "Bacarmaq"dan *f.is.*

**BACARMAQ** *f.* Əlindən gəlmək, görə bilmək, bir işi görməyə qabiliyyəti, iqtidarı olmaq, öhdəsindən gələ bilmək, müvəffəq olmaq. *İş görməyi bacarmırsan. Şahmat oynamağı bacarmıram. – Şəxs gərək elə bir iş tutsun ki, onu bacarıb yerinə yetirməyə qabiliyyəti olsun.* C.Məmmədquluzadə. [Qüdrət:] *Gəmi vermirlər? Almaq lazımdır. Almağı bacarmaq lazımdır.* M.Hüseyn.

**BACARMAZ** *sif.* və *is.* Bacarmayan, əlindən iş gəlməyən, bir işə iqtidarı olmayan adam. *Bacarmaza iş tapşırma.*

**BACARMA(MA)ZLIQ** *is.* Bacarmama, əlindən iş gəlməmə; qabiliyyətsizlik.

**BACASIZ** *sif.* Bacası olmayan. *Firidunu bir həyətdə bacasız bir tövləyə salaraq, qapını bərk-bərk bağlamışdılar.* M.İbrahimov.

**BACI** *is.* 1. Bir ata-anadan, yaxud bir atadan və ya bir anadan olan qızların bir-birinə və ya qardaşlarına olan qohumluq münasibəti. *Doğma bacılar. Əkiz bacılar.*

2. Tanış olmayan qadına, qıza ehtiramla müraciət. *Ey atalar, analar, ey gəlinlər, bacılar; Az keçər bahar kimi ürəyiniz açılar.* S.Rüstəm. // Hörmət üçün qadınların adlarına, yaxud ləqəbinə əlavə olunur. *Bu gün dərs olmamışdı, molla bacı xəstə imiş. Odur ki, Ağabəyim səhərdən dayəsindən ayrılmamışdı.* Çəmənzəminli. *Tükəzban bir döşək gətirib, Məşədi Püstə bacının altına salır.* H.Sarabski.

**BACICIQ, BACICIĞAZ** "Bacı"dan *oxş. Bacıcığazım xəstədir.*

**BACI-QARDAŞ** *is.* 1. Bacı ilə qardaş.

2. Bir-birinə çox yaxın və dost olanlar, bacı və qardaş kimi mehriban olanlar.

3. Bir-birinə çox bənzər olan iki şey; cüt, tay olan iki şey.

**BACIQIZI** *is.* 1. Bacının qız övladı.

2. Yaşlı kişinin qıza və yaxud cavan qadına nəvazişlə müraciəti. *Bacıqızı, yol buradandır?*

**BACILAŞMA** "Bacılaşmaq"dan *f.is.*

**BACILAŞMAQ** *qarş.* Bir-birinə bacı kimi yaxın olmaq, dostlaşmaq.

**BACILIQ** *is.* 1. Ögey bacı. *Qız onun bacılığıdır, bunu qızın özü söyləyir. Lakin bütün Təbriz qızı onun doğma bacısı hesab edir.* M.S.Ordubadi. ◻ **Bacılıq etmək** – 1) qayğısına qalmaq, yaxşılıq etmək; 2) doğma bacını əvəz etmək.

2. Rəfiqə, yoldaş, dost (qız, qadın). [Sara:] *Evdə tək otura bilmədiyimdən, axşamlar bacılığımgilə gedirəm.* Mir Cəlal. // İki qız və ya iki qadın arasındakı bacıcasına münasibət, əlaqə, səmimiyyət.

**BACIOĞLU** *is.* 1. Bacının oğlan övladı. [Dayısı Nadirə:] *Bacıoğlu, görünür qulaqburması yadından çıxıb, ha? – deyə altı il əvvəl döyüldüyünü xatırlatdı.* B.Talıblı.

2. Yaşlı adamın uşağa və ya cavan oğlana, yaxud öz bacısı oğluna müraciəti. *Bacıoğlu, sən kimlərdənsən? – Mən ölüm, bacıoğlu, mənim ürəyimi sıxma, dərsini yaxşı əzbərlə, yoxsa səndən küsərəm.* C.Məmmədquluzadə.

**BAC-XƏRAC** *is.* [*fars.*] b a x **bac** 1 və 2-ci mənalarda. *Xəlil paşa Koroğluya yeddi ilin bac-xəracını verdi.* "Koroğlu". *Kişi bütün dünyadan bac-xərac alır.* C.Cabbarlı.

**BAD**[1] *is. məh.* 1. Təndir və s. qurmaq üçün içinə keçi qılı qatılıb hazırlanan qatı palçıq.

2. Qazma evlərin ortasında palçıqdan qayrılan ocaq yeri.

**BAD**[2] *is.* [*fars.*] Yel, külək. *Mən aşiq, bad apardı; Bad vurdu, bad apardı; Cəfasını mən çəkdim; Səfasın yad apardı.* (Bayatı). *Bənd edib hər səhər bad əsər, arizi-canana dəyər; Toxunur sərvə gəhi, gah gülüstanə dəyər.* M.V.Vidadi. *Cadu qəmzələrin mənlən yağıdır; Bad əsir, zülfünü üzdən dağıdır.* M.P.Vaqif. ◻ **Bad(i)-səba** *şair.* – səba yeli, səhər əsən xəfif, sərin yel; meh. *Nə yanar kimsə bana atəşi-dildən özgə; Nə açar kimsə qapım badi-səbadan qeyri.* Füzuli. *Ey badi-səba, məndən ol yarə salam eylə.* M.V.Vidadi. *Pərişanlıq zülfün öz qaydasıdır; Nə badi-səbadan, nə şanədəndir.* M.P.Vaqif. *Badi-səba mənim dərdi-dilimi; Ol büti-zibaya dedin, nə dedi?* Q.Zakir.

◊ **Bad(i)-fənaya getmək** – b a x **bada getmək**. [Hacı Fərəc:] *Bunları bir-birinə qısqırram, hər ikisi birdən badi-fənaya gedər.* N.Vəzirov. *Nə qədər təqsirsiz adamlar bunun dilinin və qələminin səbəbinə badi-fənaya gediblər.* Ə.Haqverdiyev. **Bad(i)-fənaya vermək** – b a x **bada vermək.** [Əbdül:] *Gülnisənin hiyləsi, Pərinin işvəsi, pulları, havası onun* [Bəhramın] *başını elə dumanlandırdı ki, yazıq qızcığazı bad-fənaya verdi.* C.Cabbarlı. **Bada getmək –** heçə çıxmaq, puç olmaq, tələf olmaq, məhv olmaq, boşa çıxmaq, zay olmaq, hədər getmək. *Vaqif sevdi bir iqrarsız bivəfa; Bada getdi tamam çəkdiyi cəfa.* M.P.Vaqif. *Xain olsaq əgər bu dünyada; İrzü namusumuz gedər bada!* M.Ə.Sabir. *Onların ömrü də tez gedər bada; Hər kəs əkdiyini biçər dünyada.* S.Vurğun. **Bada vermək** – puç etmək, yox eləmək, məhv etmək, tələf etmək. *Ey badə verən ömrünü, zünnarə yapışma.* Nəsimi. *Yandırıb hicran odu könlümü verdi badə, gör.* Xətayi. [Göyərçin:] *Canımı çöldən tapmamışam ki, ömrümü, günümü bada verim?!* S.Rəhimov. **Hərçi bada bad** – nə olursa olsun, olan olacaq.

**BADAQ** *is.* 1. B a x **badalaq.**

2. Sınmış ağacı bərkitmək üçün ona keçirilən enli dəmir halqa.

3. Ev quşlarının ayaqlarına bağlanan bağ, ip, halqa.

4. Yastıbaşlı, itiuclu dəmir və ya ağac mıx, mismar; gülmıx.

**BADAQÇEŞNİ** *məh*. bax **badaqvari**.

**BADAQLAMA** "Badaqlamaq"dan *f.is*.

**BADAQLAMAQ** *f.* 1. Qıçları və ayaqları ilə bərk sıxmaq, tutmaq (atı, ağacı və s.).

2. Badaqla bərkitmək (bax **badaq** 2 və 4-cü mənalarda).

3. Əhliləşdirilmiş quşların ayağına badaq vurmaq, badaqla bağlamaq.

**BADAQLANMA** "Badaqlanmaq"dan *f.is*.

**BADAQLANMAQ** *məch*. Badaq vurulmaq, badaqla bərkidilmək.

**BADAQLI** *sif.* Badağı olan (bax **badaq** 2-ci mənada).

**BADAQVARİ** *sif. məh.* Mıxa oxşayan, mıx kimi, mismara oxşayan.

**BADALAQ** *is.* 1. Sərbəst güləşmə zamanı müqabil tərəfi yıxmaq üçün ayağını onun ayağına dolaşdırıb burma. ☐ **Badalaq vurmaq** – birini yıxmaq üçün ayağını onun ayağına dolaşdırmaq. *Mən yoldaşımdan qabaq çəməndə bir lalə görmüşəm.. Mən onu üzəndə dostum badalaq vurub məni üzüstə yıxır ki, laləni özü dərsin.* M.Hüseyn.

2. *məc.* Hiylə, kələk, fənd, fırıldaq mənasında. *Bir badalaq lazımdır, özü də çox balaca, təpəsi üstə dəysin yerə.* N.Vəzirov. ☐ **Badalaq qurmaq** – hiylə qurmaq, kələk gəlmək, fırıldaq düzəltmək; ayağının altını qazımaq, ayağından çəkmək. [Aslan bəy:] *Sən öləsən ağa Laçın bəy, sənin özünə də axırda bir badalaq qurmağım var*. N.Vəzirov. [Namaz:] *İndi sənin mənə badalaq qurmağının heç adı yoxdur*. Ə.Haqverdiyev. *Kərbəlayı Tapdıq bu dərdi sinirə bilmirdi, Durmuşa badalaq qurmağa çalışırdı.* Mir Cəlal.

**BADALAQLAMA** "Badalaqlamaq"dan *f. is.*

**BADALAQLAMAQ** *f.* 1. Badalaq vurmaq, badalaqla yıxmaq.

2. *məc*. Hiylə qurmaq, kələk qurmaq, fırıldaq işlətmək, dolab gəlmək, aldatmaq.

**BADALAQLANMAQ** *məch*. Badalaq vurulmaq.

**BADALAQLAŞMAQ** *qarş*. 1. Bir-birinə badalaq vurmaq, bir-birini badalaqla yıxmağa çalışmaq.

2. *məc.* Çəkişmək, bir-biri ilə yola getməmək. *Bir-birinə badalaq vurmaq*.

**BADAM** *is.* [*fars.*] İsti ölkələrdə yetişən sərt qabıqlı, ləpə şəklində ləzzətli bir meyvə və bu meyvənin ağacı. *Badam ağacı. Badam yağı. Acı badam* (dadı acı olub, yağı texnika və əczaçılıqda işlənən badam). *Daş badam* (qabığı bərk badam). *Kağızqabıqlı badam* (qabığı nazik və ləpəsi kiçik badam).

◊ **Üç badam bir qoz** *mus.* – Azərbaycan xalq musiqisində bir çox mahnı, təsnif və oyun havalarına xas olan musiqi vəzninin adı. *Azərbaycan rəqs musiqisi ölçülərindən ən çox intişar edəni: sazəndələr arasında "uç badam bir qoz" deyilən vəzn əsasında olan diringilərdir*. Ə.Bədəlbəyli.

**BADAMAĞIZ** *sif.* Ağzı çox kiçik və gözəl.

**BADAMBACI** *is. dan.* Gəlinlərə, qayınanalara və ya yaşlı qadınlara hörmət üçün verilən ad.

**BADAMBURA** bax **badamçörəyi.**

**BADAMBUTA** *sif. və is.* [*fars.*] Badam naxışlı, badamı gülləri olan (parça). *Badambuta çit. Badambuta süfrə.* – [Məmmədin] *əynində kayanı dörd ətək donu, tirmə döşlüyü, ağ badambuta qurşağı, Xorasanı abası var idi*. H.Sarabski.

**BADAMCAN** *is. bot.* Dağlarda bitən cır ərik.

**BADAMCIQ** *is. anat.* Boğazda və əsnəkdə olan və görünüşcə badama oxşayan vəzi.

**BADAMÇA** *is*. Badam ağacına bənzər xırda və çiçəkli bir ağac; dəli badam.

**BADAMÇÖRƏYİ** *is*. İçinə şəkərlə qarışıq döyülmüş badam qoyulmuş xırda şirin çörək.

**BADAMGÖZ(LÜ)** *sif.* Gözlərinin quruluşu badama oxşayan. [Ərknaz] *İran miniatürlərində rəsm edilən badamgözlü, qaraqaşlı, incəbel qızlara bənzəyirdi.* M.Hüseyn. *Badamgöz oğlum, yaxşı tanı yaponu.* R.Rza. *Allı-güllü geyinib bəzənmiş badamgözlü, şəkərsözlü qızlar, gəlinlər də yığışıb gəlmiş, .. gözəl bir məclis düzəlmişdi.* M.Rzaquluzadə.

**BADAMI** *sif.* Badamşəkilli, badama bənzər. *Yanaqları lalə, gözləri badamı; Bağrımı*

*qan etdi ləli-gülfamı*. Nəbati. [Gəlin] *çatma, uzun qaşları altında badamı gözlərini bircə an Xəlilə zilləyib, tez geri çəkdi*. M.Hüseyn.

**BADAMIBUTA** bax **badambuta**. [Kişinin] *ayağında gen lifəli qara mahud şalvar və qırmızı badamıbuta corab vardır*. H.Sarabski.

**BADAMLI[1]** *sif*. Badamdan və ya badamla hazırlanan, içərisində badam olan. *Badamlı konfet. Badamlı qoğal. – Eşidirəm ki, dadlı-dadlı xuruşlar, badamlı paxlavalar çox yeməli imiş*. "Mol. Nəsr.".

**BADAMLI[2]** *is*. Müalicə üçün içməli su [Naxçıvanda Badamlı deyilən yerin adından].

**BADAMLIQ** *is*. Badam bağı, badam ağacları əkilmiş yer.

**BADAMŞƏKİLLİ** bax **badamı**. [Zibeydə] *brilyant düzülmüş badamşəkilli cıqqasını .. taxdı*. M.S.Ordubadi.

**BADAMVARİ** bax **badamı**.

**BADAR** *məh*. 1. *is*. Kiçicik əkin yeri.

2. *sif*. Dağınıq, pozuq.

**BADAŞ** bax **bardaş.**

**BADBADI** bax **bat-bat.**

**BADBAN** *is*. [*fars*.] Ensiz nazik taxta çərçivəyə yapışdırılmış və uzun sapa bənd edilərək, havaya uçurulan kağız; çərpələng. *Badban uçurmaq. – Barıt və qeyri bu kimi atılan əczaları şar və badban ilə havaya qaldırıb orada atanda havada olan qazlar qəlizləşib və yağış olub yerə düşür.* H.Zərdabi.

**BADƏ** *is*. [*fars*.] *şair*. 1. Şərab, çaxır. *Badə düşkünü. – Qəmzən görünməyib gözə, qanlar içər müdam; Zahid kimi ki, badəni eldən nihan içər*. Füzuli. *Könül, meyxanə cənnət, badə kövsər, saqidir qılman; Gedib vaiz deyən nisyə sözə ümidvar olma*. S.Ə.Şirvani. // Obrazlı təşbihlərdə. *Ey dəhanı şəkkər, ləbləri badə; Gün cəmalın eşq əhlinə ayinə.* M.V.Vidadi. *Badənin ləli-ləbi dilbərə çün nisbəti var; Tökmərəm badəni mən sağərə bundan sonra.* S.Ə.Şirvani.

2. *məc*. Şərab piyaləsi mənasında. *Koroğlu əlini uzadıb bir badə doldurdu.* "Koroğlu". *Sərtib bir badə də konyak içdi.* M.İbrahimov. *Vaxtdır, badələri qaldırın, dostlar! İçək təzə ilin şərəfinə biz.* S.Vurğun.

**BADƏNUŞ** *sif*. və *is*. [*fars*.] Şərab içən, içki içən; əyyaş.

**BADƏPƏRƏST** *sif*. və *is*. [*fars*.] İçki düşkünü, şərab düşkünü.

**BADI** *is. məh*. Saxsı nimçə, dövrə.

**BADIMCAN** *is*. Tünd-bənövşəyi rəngli tərəvəz bitkisi. *Badımcan ləki. Badımcan dolması.*

**BADIMCANBURUN** *sif. dan*. Yekə, göyərmiş burnu olan. *Uzunbığ və badımcanburun mirab xəşəl qarnını qabağa verib içini arıtladı*. S.Rəhimov.

**BADIMCANÇİÇƏKLİLƏR** *cəm, bot*. Birillik və çoxillik yarımkol və ya kolşəkilli bitkilər fəsiləsi.

**BADIMCANI** *sif*. Badımcan rəngli, tündbənövşəyi. *Badımcanı sətin*.

**BADIMCANLIQ** *is*. Badımcan əkilmiş yer.

**BADIŞ** *is*. 1. Toyuqların ayağına nişan üçün tikilən əsgi, çit parçası. // Alıcı quşların baldırına keçirilən tumac qayış; cılğı.

2. Sapdan toxunma halqa.

**BADKEŞ** *is*. [*fars*.] *köhn*. 1. Xalq təbabətində müalicə məqsədi ilə işlədilən küpə, banka, stəkan və s.; həcəmət. ☐ **Badkeş qoymaq (eləmək, salmaq)** – xəstə adamın qanını oynatmaq üçün bədəninin müxtəlif yerlərinə banka qoymaq.

2. Dəmkeş, külbə.

**BADMİNTÓN** *is. idm*. Raketka və ləlməkvari topla oynanılan, tennisə bənzəyən idman növü.

**BADYA** *is*. İçinə süd sağmaq, yaxud maye tökmək üçün misdən, saxsıdan və s.-dən qayrılan altı gen böyük qab. [Pəri xanım:] *A qız, o böyük badyanı gətir.* M.F.Axundzadə. *Kənd çocuqları əllərində badya, mis kasa dərəyə doğru qoşurdular*. A.Şaiq. *Səhənglər, vedrələr, qazanlar, badyalar doldu, boşaldı.* M.Hüseyn.

**BADYAÇA** *is*. Balaca badya. [Qızqayıt] *əlini ataraq, ocağın qırağındakı xəmirli badyaçanı qaldırıb, suyunu başına çəkdi*. S.Rəhimov.

**BADYAN** *is. bot.* Kolluqlarda, zibilli yerlərdə bitən zəhərli bitki.

**BAFA** *is. məh*. Dərz bağlamaq üçün biçinçinin biçib bağladığı sünbül toplusu. [Hüseyn:] *Marquşa, bəs özgə vədə beş bafadan bağlayırdın?* Ə.Vəliyev. *Qırmızı yaylıqlı*

*kəndli .. bağladığı bafanı alıb, Büləndin yanına gəldi.* Ə.Əbülhəsən.

**BAFTA** *is.* [*fars.*] Güləbətin, ipək saplardan toxunmuş qaytan. [Güləndam:] *Məmmədəli, hələ bir de görüm, baftanı gətirmisənmi?* N.Vəzirov.

**BAFTAÇI** *is.* Bafta ustası, bafta toxuyan usta.

**BAFTAÇILIQ** *sif.* Baftaçının sənəti, işi.

**BAFTALAMA** "Baftalamaq"dan *f.is.*

**BAFTALAMAQ** *f.* 1. Bafta ilə işləmək, bafta ilə bəzəmək, baftadan köbə tikmək. *Donun ətəyini baftalamaq.*

2. *məc. dan.* Özündən toxumaq, uydurmaq.

**BAFTALI** *sif.* Bafta ilə işlənmiş, bafta ilə bəzəkli, bafta tikilmiş, baftadan köbə tikilmiş. *Ağcaxanım abı, pəncə-pəncə zərli donunu, döşü baftalı, qırmızı tafta köynəyini geyib, .. mətbəxdə plov bişirməkdədir.* H.Sarabski. *Güllü arvad sumağı şaldan gen-bol qırmızı tuman, .. yaxası və qolunun ağzı baftalı uzun arxalıq geymiş*(*di*)*.* Ə.Əbülhəsən.

**BAFTAŞALVARLI** *sif.* və *is. köhn.* Keçmişdə polis və hərbi işçilərə verilən ad. [Rəna:] *Doğrudur ki, mənim atam, babam çox varlı idi; Hətta böyük qardaşım baftaşalvarlı idi.* S.Rüstəm.

**BAĞ**[1] *is.* 1. Meyvə ağacları əkilmiş sahə. *Meyvə bağı. Alma bağı. Bağ salmaq.*

2. Müxtəlif ağaclar əkilmiş sahə. *Şəhər bağı.* ◻ **Heyvanat bağı** – ictimai bağda və ya parkda elmi məqsədlər üçün düzəldilən heyvanxana. **Nəbatat bağı** – elmi məqsədlər üçün dünyanın bütün ölkələrinə və müxtəlif iqlimlərə məxsus bitkilər yetişdirilən bağ.

3. *məc.* Güllük, çiçəklik, yaşıllıq yer. *Mənim bağım, baharım, həm gülüm, həm bülbülüm sənsən.* S.Ə.Şirvani. *Bağı tutar ətridəhanım mənim; Eybi nədir, varsa tikanım mənim.* A.Səhhət.

4. *məh.* Yaylaq, şəhərdən kənarda bağbağat yer, istirahət yeri. *Yayda ailəmiz bağa köçür. – Axırda həkim nənəmə dedi: – Bir az qanı azdır, göndər getsin bağa.* H.Sarabski.

**BAĞ**[2] *is.* 1. Bağlamağa yarar hər şey, ip, kəndir, qaytan və s. *Yükün bağlarını açmaq. Ayaqqabı bağı. – Musa kişi yaş ot bağlarından birini açıb, onların qabağına tökdü.* M.İbrahimov. [Kəmtərov] *gah damağındakı papirosu barmaqları arasına alıb sıxır, gah çəkməsinin sallanan bağına baxır, məna vermir, daha da yeyinləyir.* Mir Cəlal. // Sarğı.

2. Dəstə, kom, bağlı şey, bağlama. [Arabaçı] *haradansa bir bağ yonca gətirdi, saldı atların qabağına.* C.Məmmədquluzadə. *Bir bağ vəlim tapammır biçarə yandıra; Möhtacdır özü və əyalı hərarətə.* M.Möcüz.

3. *məc.* Bağlayan, birləşdirən, əlaqələndirən şey; əlaqə, rabitə mənasında. *Dostluq bağları.*

**BAĞA**[1] b a x **tısbağa.**

**BAĞA**[2] *is. məh.* Atların buxovluğunda əmələ gələn xəstəlik (yara).

**BAĞACIQ** *is. zool.* Taxıl bitkilərinə zərər verən cücü. *Taxıl bitkilərinin* (*xüsusən buğdanın*) *qorxulu zərərvericisi olan taxıl bağacıqlarına qarşı mübarizə üçün bioloji üsul geniş tətbiq edilir.*

**BAĞALIQ** *is. məh.* Atın dırnaqlarının üst (tük qurtaran) tərəfi.

**BAĞAM** *is. məh.* Enli yarpaqları olan və yarpaqlarından dəri boyamaq üçün boya hazırlanan bir ağac.

**BAĞANAQ** *is.* Qıçların hövsələ sümüyünə bitişən yeri.

**BAĞANCAQ** *is. məh.* Atın topuğu ilə dırnağı arasındakı hissə; buxovluq.

**BAĞANCANAQ** *is. məh.* Heyvanların ayaqlarının yerə dəyməyən hissəsi.

**BAĞARA** *is. məh.* 1. B a x **tağalaq.**

2. Dayaz quyulardan dol ilə su, neft çəkmək üçün qurğu. *Babası ..* [Araza] *öz cavanlığından, fəhləlik həyatından söz açıb deyirdi: – Səhərdən axşama qədər atı bağaraya qoşub, neft çəkərdim.* A.Şaiq. *Yaxşı yadımdadır o dol, bağara*; *Hərlənib neft çəkən gözü bağlı at.* M.Rahim.

**BAĞAT** b a x **bağ-bağat.** *Qoy bağ olsun, bağat olsun qapımızın dörd yanı.* S.Vurğun.

**BAĞAYARPAĞI** *is. bot.* Adətən arxların kənarında bitən enliyarpaqlı bir bitki olub, xalq təbabətində yaraları sağaltmaq üçün işlənir. *Çoxillik bitki olan bağayarpağı uzun saplaqlı kökyanı yarpaqlara malikdir; yarpaqlarının forması dairəvi, kənarı isə bütövdür.* Əliyev.

**BAĞ-BAĞAT** *is.* Bağlıq, ağaclıq, yaşıllıq. *Seyidli və onu əhatə edən kəndlərin bağ-*

*bağatı o dərəcədə boldur ki, göz ətrafda ot və ağacdan savayı bir şey görmür*. S.S.Axundov. *Daşlıca azı kənddən beş verst bağ-bağat yollarının ayrıcında bir yer idi*. Mir Cəlal. *Maştağa kəndinin .. bağı-bağatı başqa kəndlərə görə bir qədər abad idi.* H.Sarabski.

**BAĞ-BAĞATLI** *sif*. Bağ-bağatı, yaşıllığı olan, səfalı. *Bağ-bağatlı yer*.

**BAĞ-BAĞÇA** *is*. Bağlıq və güllük yer. *Cuma baxımsız qalmış bağ-bağçalara göz yetirirdi.* Ə.Əbülhəsən. *Boz dağları meşə örtdü, sahilləri gül; Bağ-bağçaya şeh çilədi nazəndə səhər.* Ə.Cəmil.

**BAĞBAN** *is*. [*fars.*] 1. Bağa baxan, bağa qulluq edən adam; bağ yetişdirməklə, bağçılıqla məşğul olan adam; bağçı. *Gördülər yüz yaşında bir bağban; İşləyir bağda səy ilə hər an.* M.Ə.Sabir. *Həyatimdə səfalı bir bağ salacağam mən; Yurdumda bir misilsiz bağban olacağam mən.* M.Müşfiq.

2. *məc*. Qayğı ilə bəsləyən, tərbiyələndirən, yetişdirən adam, tərbiyəçi mənasında.

**BAĞBANLIQ** *is*. Bağbanın peşəsi, işi, sənəti; bağçılıq. *Bağbanlıq etmək.*

**BAĞBAŞI** *is*. Köhnə məişətdə: oğlanın öz nişanlısına göndərdiyi bağ novbarı; sovqat. *Pişxidmət məcməyidə alma, armud, nar və əzgil gətirib, qonaqların qabağına qoydu. Bunlar hamısı bağbaşı olaraq kəndlərdən göndərilmişdi.* Çəmənzəminli. *Habelə yay zamanı qız evi bağa köçsəydi, oğlan evi bağbaşı aparmalı idi.* H.Sarabski.

**BAĞ-BƏRƏ** *is*. Ev yanında bağ-bağça. *Elə gəl, elə get bağ-bərəsindən; Bülbüllər ürküşüb, gül inciməsin*. Aşıq Abbas.

**BAĞÇA** *is*. 1. Kiçik bağ, həyət bağı. *Ay çıxıb bağçanı işıqlatmışdı.* Ə.Məmmədxanlı. *Şirin bağçada səndəl üstündə oturmuşdu*. İ.Əfəndiyev.

2. *məc.* Güllük, çiçəklik. *Bu otağın pəncərələri .. qarşıdakı qızılgül bağçasına açılırdı.* S.Rəhimov.

3. Məktəb yaşına çatmamış uşaqlar üçün tərbiyə, əyləncə müəssisəsi ("uşaq bağçası" şəklində də işlənir). *Uşağı bağçaya verdim.*

**BAĞÇA-BAĞ** *is*. Güllük, çiçəklik. *Ürəksiz əkilən yerlər saralar; Şitillər boy atıb bağça-bağ olmaz.* S.Vurğun. *Qış ayazdan bitkiləri saxlayıb; Şeh salırsız bağça-bağa, buludlar!* H.K.Sanılı.

**BAĞÇACIQ** "Bağça"dan *kiç*. *Suyun sahilində bir bağçacıq var.* S.Vurğun.

**BAĞÇALI** *sif*. Bağçası olan; həyətində çiçəklik, güllük olan. *Bağçalı ev. Bağçalı məktəb.*

**BAĞÇALIQ** b a x **bağça.** *Xanın evinin qabağı çiçəklik və böyük bağçalıqdı.* M.S.Ordubadi.

**BAĞÇAPƏRƏST** b a x **bağpərəst.**

**BAĞÇI**[1] *is*. 1. B a x **bağban** 1-ci mənada. *Qonşu respublikalardan gəlmiş qonaqlar Qubanın bağçıları və məktəbliləri ilə səmimi görüşü heç zaman unutmayacaqlar*.

2. *məh*. İstirahət üçün yayda bağa (b a x **bağ**[1] 4-cü mənada) köçən, bağda istirahət edən adam. *Şəhərə yaxın olduğundan, bağçılar buranın* [Maştağa kəndinin] *bağlarına çox köçərdilər.* H.Sarabski.

**BAĞÇI**[2] *is. məh.* Biçinçilərin ardınca dərz bağlayan işçi.

**BAĞÇILIQ** b a x **bağbanlıq.** *Kənd klubunda kəndlilər savad öyrənir, əkinçiliyə, bağçılığa, maldarlığa aid məlumat alırlar.* S.Hüseyn. *Sağ ol, baba, sən bağçılıq işini yaxşı bilirsən.* M.Seyidzadə.

**BAĞÇIVAN** *is. köhn.* Bağçaya baxan, bağça yetişdirən; bağban.

**BAĞÇIVANLIQ** *is. köhn.* Bağçıvan işi, bağçıvan sənəti; bağbanlıq. // Bağ, çiçək, ağac və səbzəvat yetişdirmə. *Maşallah, nə yaxşı qabilsən; Bağçıvanlıqda xeyli kamilsən*. A.Səhhət.

**BAĞÇİYƏLƏYİ** *is. bot.* Bostanda yetişdirilən iri çiyələk növü.

**BAĞDAŞ** b a x **bardaş.**

**BAĞDATI** *is*. [*xüs. is.*-dən] 1. Suvaqla suvanmış tavan, səqf. *Otağın bağdatısı uçulmuşdur.*

2. Suvağı saxlamaq üçün arakəsmə divarlara və tavana vurulan ensiz taxtalar.

**BAĞIR** *is*. 1. Qaraciyər.

2. Ürək, qəlb mənasında. *Ey Füzuli, ol sənəm əfğanıma rəhm eyləməz; Daşə bənzər bağrı, təsir eyləməz əfğan ona*. Füzuli. *Edən qan qönçə tək bağrım o ləli-abidar olmuş.* Nəbati. *Oxuduqca şirin-şirin diliniz; Bağrım olur şana-şana, durnalar*. M.V.Vidadi.

◊ **Bağrı çatlamaq** – 1) davam gətirməyib ölmək, ürəyi partlamaq. *Atı o qədər bərk sürdü ki, heyvanın az qala bağrı çatlamışdı.* – [Tarverdi:] *Əgər Pərzad məni bu halda görə bilsəydi, qorxudan bağrı çatlardı.* M.F.Axundzadə. *Bir çoxları qızın bağrı çatlamış olduğunu zənn edərək təəssüflənirdi.* M.S.Ordubadi. [Əbdül:] *İndi biçarə Saraya necə deyim ki, Bəhram gəlmir, bağrı çatlar.* C.Cabbarlı; 2) b a x **bağrı yarılmaq**; 3) ürəyi bərk darıxmaq. *Uşaq olmasaydı, qızın bağrı çatlardı.* M.S.Ordubadi. [Vəli:] *Yaxşı ki, bir yerdəyik, tək olsaydıq, adamın bağrı çatlardı.* M.Hüseyn. **Bağrı daşa dönmək** – çox sərt olmaq, insafsız olmaq, rəhmsiz olmaq, sərtləşmək. *Təğafül etməyin, Allahı sevər; Dönməsin bağrınız daşa, durnalar.* Q.Zakir. **Bağrı dəlinmək** – b a x **bağrı qan olmaq (qana dönmək).** *Bəs olmadı, getdi yar əlindən; Həm bağrı dəlindi xar əlindən.* Məsihi. **Bağrı qan olmaq (qana dönmək)** – son dərəcə müztərib və mütəəssir olmaq, kədərlənmək, qüssələnmək. *Ala gözlüm, səndən ayrı düşəli; Ah çəkməkdən bağrım qana dönübdür.* Aşıq Ələsgər. **Bağrı yanmaq** – 1) susamaq; 2) *məc.* həsrət çəkmək, hicran keçirmək. *Bax bu qaşa, bax bu gözə; Yandı bağrım, döndü közə.* Aşıq Ələsgər. **Bağrı yarılmaq** – 1) ölmək; 2) bərk qorxmaq, dəhşətə düşmək. *Bağrım yarılır xəncəri-bürranını görcək.* M.Ə.Sabir. [Məşədi Əsgərin] *silisçidən bağrı yarılırdı.* S.M.Qənizadə. [Gülnisə:] *Danışanda adamın gözünün içinə bir tövr baxır ki, az qalır adamın bağrı yarılsın.* Ə.Haqverdiyev. [Döyüldüyü üçün] *uşaq molladan qaçar və molla adı gələndə bağrı yarılardı.* H.Sarabski. **Bağrına basmaq** – məhəbbətlə, nəvazişlə qucaqlamaq. *Tutuban bağrına basdın o səri-zülfü, könül; Belə fikr eylədin, ol müşk sənin canındır.* S.Ə.Şirvani. *Oturmuş ana, basmış bağrına; Nazlı körpəsin, lay-lay der ona.* A.Səhhət. *Xədicə rəngi qaçmış .. halda içəri girdi və uşaqlarını bağrına basıb .. ağladı.* S.S.Axundov. **Bağrını çatlatmaq** – bax **bağrını yarmaq.** **Bağrını dəlmək** – son dərəcə kədərlənmək. **Bağrını qana döndərmək (qan eləmək)** – həddən artıq kədərləndirmək, iztirab vermək. *Ləli-nabin həvəsi bağrımı qan eylədiyin; Ah kim, qanlı yaşım qılmadı izhar sana.* Füzuli. *Ələsgərəm, sana qurban; Gəl eyləmə bağrımı qan!* Aşıq Ələsgər. **Bağrını yarmaq** – 1) öldürmək; 2) bərk qorxutmaq, dəhşətə salmaq. *Bütün dağlar arasında İskəndər bəyin adı söylənirdi. İgidlikdə, at çapmaqda, düşmən bağrı yarmaqda tayı-bərabəri yox idi.* Ə.Haqverdiyev. *Yuvasında eşələnən bir qırğı onların bağrını yarmışdı.* Mir Cəlal. [Xəlil:] *Ay balam, bir az özünə toxtaqlıq ver, uşaqların bağrını yarma.* P.Makulu.

**BAĞIR-BADAŞ** b a x **bağrıbadaş.**

**BAĞIRBEYİN** *is. aşp.* Quzunun qaraciyəri ilə beynindən və ya quyruğundan hazırlanan xörək. *Hər adama bir məcməyi verildi və üstündə quzu soyutması, yanında da sarımsaqlı qatıq və bağırbeyin vardı.* Çəmənzəminli.

**BAĞIRDAQ** *is. məh.* Beşikdə uşağı bağlamaq üçün bağ; beşik bağı.

**BAĞIRDAQLAMAQ** *f. məh.* Beşikdə uşağı bağırdaqla bağlamaq.

**BAĞIRDƏLƏN**[1] *sif.* Qorxudan, dəhşətə salan; dəhşətli, qorxunc.

**BAĞIRDƏLƏN**[2] *is. məh.* Yulaf sünbülünə bənzər qılçıqlı ot.

**BAĞIRIŞ** *is.* Bağırma işi və tərzi. // Nərə.

**BAĞIRIŞMA** "Bağırışmaq"dan *f.is.*

**BAĞIRIŞMAQ** *qarş.* Səs-səsə verib qışqırmaq, hamı birdən çığırmaq, çığırışmaq; səs-küy qoparmaq, qalmaqal salmaq, çığırbağır salmaq. *Uşaqlar bağırışırlar. – Hamımız bağırışaraq, kəkliyin arxasınca xeyli baxdıq.* A.Şaiq.

**BAĞIRQAN** *sif.* Çox bağıran, qışqırıqçı. // Ağlağan.

**BAĞIRMA** "Bağırmaq"dan *f.is.*

**BAĞIRMAQ** *f.* 1. Bərk qışqırmaq, çığırmaq. *Mən əzilən bir sinfin hayqıran; Haq bağıran sədasından yarandım.* M.Müşfiq. [Səriyyə xala] *bağırmaq, ağlamaq istəyir, bacarmırdı.* M.İbrahimov. *Xaspolad bir də ucadan bağırdı.* M.Hüseyn. □ **Bar-bar bağırmaq** – şiddətlə, var gücü ilə çığırmaq. [Kərim baba:] – *Bu şələni hara töküm? – deyə bar-bar bağırdı.* A.Şaiq.

2. Böyürmək, nərə çəkmək. *Bir az daha irəliləmişdim ki, birdən-birə pələng yerindən sıçrayıb bağıra-bağıra* (z.) *üstümə gəldi*. A.Şaiq.

3. Ağlamaq, haray salmaq, fəryad etmək. *Bağırmaqdan uşağın az qala ürəyi partlamışdı*.

**BAĞIRSAQ** *is*. 1. *anat*. Həzm prosesində mühüm rol oynayan bədən üzvü, selikli, elastik borular şəklində olur. □ **Acı bağırsaq** – bağırsaqların mədə ilə yoğun bağırsaq arasındakı hissəsi, nazik bağırsaq. **Düz bağırsaq** – bağırsaq kanalının dal hissəsi, qurtaracağı. **Kor bağırsaq** – yoğun bağırsağın soxulcanşəkilli çıxıntısı olan qurtaracaq hissəsi. **Onikibarmaq bağırsaq** – insanın nazik bağırsağının bir hissəsi. **Yoğun (qalın) bağırsaq** – acı bağırsaqdan sonra gələn yoğun hissə.

2. İçərisindən su axıtmaq üçün rezin və ya brezent boru; şlanq.

◊ **Bağırsaq, yaxud acı bağırsaq kimi (uzanmaq)** – bir-birinin ardınca, arasıkəsilməz sıra ilə yerimək, gəlmək, keçmək; axırı, sonu olmayan, qurtarmaq bilməyən şey haqqında. **Bağırsaqları qırılmaq (gülməkdən)** – çox gülmək, gülməkdən qarnına sancı düşmək. *Bizim pulemyotlar qaqqıldayanda sizinkilərin dovşan kimi qaçmaqlarını görsəydiniz, gülməkdən bağırsaqlarınız qırılardı*. H.Nəzərli. **Bağırsaqlarını yerə tökmək** – öldürmək.

**BAĞIRSAQBOŞLUQLULAR** *cəm, zool*. Mədəsi, yaxud mədə rolunu oynayan qarın boşluğu olan ibtidai heyvanlar. *Müxtəlif meduzalar, poliplər və mərcanlar bağırsaqboşluqlular adlanır*.

**BAĞIRSAQLIQ** *is. anat*. Qarnın bağırsaqlar yerləşən hissəsi. // İnsanın və ya heyvanın bütün bağırsaqları.

**BAĞIRSAQSIZ** *sif*. Bağırsağı olmayan. *Bağırsaqsız heyvanlar*.

**BAĞIRTI** *is*. Çığırtı, nərə; bağırma səsi. *Birdən Qaraca qızın qulağına ayının bağırtısı gəldi*. S.S.Axundov. // Səs-küy, qışqırtı, fəryad. *Bağırtı salmaq. Bağırtı qoparmaq*. – [Əbülhəsən bəy:] *Bir bağırtı eşitdim, bu Smirnovun bağırtısı idi*. M.S.Ordubadi. *Bayaqkı qışqırtı və bağırtıdan hürkmüş .. müdir nəfəs aldı*. M.İbrahimov.

**BAĞIRTMA** "Bağırtmaq"dan *f.is*.

**BAĞIRTMAQ** *icb*. 1. Çığırtmaq, qışqırtmaq; bağırmasına səbəb olmaq.

2. Ağlatmaq. *Uşağı bağırtmaq*.

**BAĞIRYARAN** b a x **bağırdələn**[1]. *Çoban ona* [düşmənə] *qalxmağa fürsət verməyib, çomağı başına çırpdı və özü bağıryaran bir səslə qıy vurub, irəli şığıdı*. M.Rzaquluzadə.

**BAĞISTAN** *is*. [*fars*.] Bağlıq, çoxlu bağ olan yer.

**BAĞIŞLAMA** "Bağışlamaq"dan *f.is*.

**BAĞIŞLAMAQ** *f*. 1. Bir şeyi qarşılıqsız (əvəzsiz) olaraq başqasına vermək, hədiyyə etmək, peşkəş vermək. *Atası öləndən sonra Niftalı ona torpaq da verdi, .. mal-qaradan pay ayırıb, bir at da bağışladı*. İ.Şıxlı. // *məc*. Bəxş etmək, vermək. *Elə bil, bağışladın mənə sevinc dolu bir aləmi*. R.Rza.

2. Alacağından könüllü olaraq vaz keçmək, əl çəkmək; özünə çatacaq şeyi daha istəməmək. *Borclarını bağışlamaq*.

3. Günahından, təqsirindən keçmək, əfv etmək. *Məncə yaraşmayır çoxuna bu ad; Məni bağışlasın sevgilim həyat*. S.Vurğun. *..Mənim dediklərimdə səhv və yanlışlıqlar olsa, bağışlamanızı xahiş edirəm*. Mir Cəlal.

4. Əmr şəklində: **bağışla, bağışlayın, bağışlayınız** – 1) söylənməmiş bir sözə, yaxud namünasib bir işə görə üzr istəmək və ya söylənmiş bir fikri düzəltmək üçün deyilir. *Bağışlayın, mən bilmədim ki, bu söz sizin xatirinizə dəyəcək. Sizi narahat etdiyim üçün məni bağışlayın. Səni çox gözləməyə məcbur etdim, bağışla. – Səni əhlivəfa bilmişdim, ey gül, bivəfasanmış; Bağışla, bilmişəm biganələrlə aşinasanmış*. S.Ə.Şirvani. *Mən əvvəldən bunu duymuşdum ki, siz, bağışlayınız, bir az düz adama oxşamırsınız*. C.Məmmədquluzadə; 2) bir söz və ya hərəkətlə razı olmamağı və ya ona qarşı etirazı ifadə etmək üçün qətiyyən, heç, yox mənasında işlənir. *Bağışla, elə şey yoxdur! Bağışlayın, mən buna heç vaxt razı ola bilmərəm*.

5. Bir sıra isimlərə qoşularaq mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: təsir bağışlamaq, ömrünü bağışlamaq.

**BAĞIŞLAN(IL)MAZ** *sif*. Bağışlanıla bilməyən, bağışlanmağa layiq olmayan, əfv-

edilməz. *Bağışlanılmaz nöqsan. Bağışlanılmaz günah. Bağışlanılmaz qüsur.*

**BAĞIŞLAN(IL)MAZLIQ** *is.* Bağışlanıla bilməmə, əfv edilməzlik.

**BAĞIŞLANMA** "Bağışlanmaq"dan *f.is.*

**BAĞIŞLANMAQ** *məch.* 1. Qarşılıqsız (əvəzsiz) olaraq başqasına verilmək; hədiyyə edilmək, peşkəş edilmək.

2. Əfv edilmək, cəzadan azad edilmək, təqsirindən keçilmək. *Günahı bağışlanmaq.*

**BAĞIŞLATDIRMA** "Bağışlatdırmaq"dan *f.is.*

**BAĞIŞLATDIRMAQ** b a x **bağışlatmaq.**

**BAĞIŞLATMA** "Bağışlatmaq"dan *f.is.*

**BAĞIŞLATMAQ** *icb.* Bağışlanılmasına səbəb və ya vasitə olmaq.

**BAĞLAMA** *is.* 1. "Bağlamaq"dan *f.is.*

2. İçi dolu və ağzı bağlı kisə; çuval və s. *Nigarançılığım bir az da artdı, özümü itirdim. Bağlamanın kəndirini dartıb qırdım.* Mir Cəlal. *Nəhayət,* [müəllimə] *qazıdığı quyudan bir böyük bağlama çıxartdı.* Ə.Məmmədxanlı. // Düyünçə, bağlanmış şey, boğça. *İpək bağlamaya dayanıb oturan bu qadın, bizi görərkən ayağa qalxdı.* M.S.Ordubadi. [Göyüşoğlu] *əlində tutduğu xırdaca bağlamanı dalında gizlətmişdi.* M.Hüseyn. *Arvad tez bağlamanı götürüb açdı, nə idi? İki min manat pul.* B.Talıblı. // Bir yerə, yaxud üst-üstə yığılıb sarınmış şey. *Çamadanın dibində qaytanla sarıqlı bir bağlama kağız nəzərə gəldi.* S.M.Qənizadə.

3. Bir yerə göndərilmək üçün qablanıb bağlanmış şey. *Uşaqlar gənc və mehriban müəllimlərini unutmamışlar. Məktəbdə .. ona məktub və bağlamalar göndərməyi qərara almışdılar.* Mir Cəlal.

4. Deyişmə zamanı aşıqların və keçmişdə şairlərin bir-birini bağlamaq (8-ci mənada) üçün söylədikləri müəmma, qıfılbənd, tapmaca və s.

**BAĞLAMAQ** *f.* 1. İp və başqa materiallar vasitəsilə şeyləri bir-birinə rəbt etmək. *Atları axura bağlamaq. Qayığı körpüyə bağlamaq. Toyuğun ayaqlarını bağlamaq.* // İp və s. ilə bir şeyi başqasına və ya bir neçə şeyi bir yerə rəbt etmək, tərtib etmək, düzəltmək. *Gül dəstəsi bağlamaq. Şələ bağlamaq. Dərz bağlamaq.* // Boğça etmək, boğça halına gətirmək. *Paltarlarını bağlamaq. Şeylərini bağlamaq.*

2. Sarımaq, sarğı keçirmək, sarğı ilə sarımaq. *Yaranı bağlamaq. Başına yaylıq bağlamaq.* – [Rüstəm bəy:] *Yara gərək bağlana, bağlanmasa olmaz. Bəlkə xətərli yaradır.* N.Vəzirov. *..Ağarza kəmərini bağlayıb, onun dalınca tələsdi.* Mir Cəlal.

3. Taxmaq, asmaq, qurşanmaq. *Belinə qurşaq bağlamaq. Xəncər bağlamaq. Tapança bağlamaq.*

4. Qapamaq, qıfıllamaq, kilidləmək. *Qapıları bağlamaq. Dükanları bağlamaq.* – [Növrəstə:] *Necə eləyim, ana! Bir də görəcəksən, gəldi qapını bağladı.* Ə.Haqverdiyev.

5. Düyməələmək, ilməkləmək, keçirmək. *Paltonun yaxasını bağlamaq.*

6. Yapışdırmaq. *Paketin ağzını bağlamaq.*

7. Kəsmək, qabağını almaq, mane olmaq. *Yolu bağlamaq. Suyu bağlamaq. Qazı bağlamaq.*

8. *məc.* Məğlub etmək, üstün gəlmək (deyişmədə). *Zərnişan onunla* [aşıqla] *deyişmişdi. "Sinədən" dediyi sözlərlə aşığı bağlamışdı.* M.Arif.

9. Qurmaq, düzəltmək, qayırmaq, quraşdırmaq, tikmək. *Kərdi bağlamaq. Qundaq bağlamaq. Körpü bağlamaq.*

10. İsnad vermək, üzərinə atmaq, əlaqədar etmək. *İşin axırını gətirib ona bağladılar. – Bu iftiranı ingilislər ədavət yolunda İran dövlətinə bağlayıb, qəzetlərində yazırlar.* M.F.Axundzadə. *Hər kəsə bağlayırıq hər cürə böhtan, olsun.* M.Ə.Sabir.

11. *məc.* Birləşdirmək, yaxınlaşdırmaq, əlaqələndirmək, rəbt etmək. *Onları tale bir-birinə bağladı.* Ə.Əbülhəsən. *O öz həyatını mənim müəyyən olmayan həyatımla bağlamaqdan heç də qorxmayır.* M.S.Ordubadi. *Alovlu gəncliyin bitməz və isti ehtirasları onları bir-birinə bağlamışdı.* Mir Cəlal.

12. *məc.* Rəbt etmək, quraşdırmaq, bir araya gətirmək. *Cümlələri bir-birinə bağlamaq. Bu adam iki sözü bir-birinə bağlaya bilmir.*

13. Bənd etmək, aşıq etmək. *Necə ki, haman adam da sənin damarını tapdı, ruhunu oxşadı və özünə bağladı.* M.S.Ordubadi.

14. Yazmaq, tərtib etmək, qoşmaq, düzəltmək. *Kitab bağlamaq. Akt bağlamaq. Dastan*

*bağlamaq*. – [Kərim baba:] *Mən əgər yazı-pozu bilsəydim, gənclikdə göstərdiyim igidlikləri bir-bir yazar, böyük bir kitab bağlardım.* A.Şaiq.

15. *məc*. Ləğv etmək, təsviyə etmək, yığışdırmaq, aradan qaldırmaq, rəsmən qadağan etmək.

16. Bir şeyin gedişini dayandırmaq, nəhayət vermək. *İclası bağlamaq. Konfransı bağlamaq. Sərgini bağlamaq.*

17. Üz tutmaq, örtülmək. *Qaymaq bağlamaq. Köz bağlamaq* (yara). *Qabar bağlamaq. Piy bağlamaq. His bağlamaq. Qartmaq bağlamaq. Kif bağlamaq. – Yol qıraqlarındakı sular və gölməçələr buz bağlamış, Savalanın başı əbədi duman içində itmişdi.* M.İbrahimov. *O zaman üzəri sıx bulud layları ilə örtülmüş göy, buz bağlamış bir göl kimi çatladı.* Ə.Məmmədxanlı.

18. Hasil etmək, zahir etmək, əmələ gətirmək. *Toxum bağlamaq. Rişə bağlamaq. Qabıq bağlamaq. Daş bağlamaq.*

19. Təşkil etmək, düzəltmək. *Sıra bağlamaq. Səf bağlamaq.*

20. Bir məsələ və ya təəhhüd haqqında birisi ilə rəsmi olaraq müəyyən qaydada razılaşmaq, şərtləşmək; qəbul etmək, imzalamaq. *Sülh bağlamaq. Müqavilə bağlamaq. Şərt bağlamaq.*

21. Bir sıra isimlərə qoşularaq mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: bel bağlamaq, könül bağlamaq, ümid bağlamaq.

**BAĞLAMÇA** *is.* Kiçik bağlama.

**BAĞLANMA** "Bağlanmaq"dan *f.is.*

**BAĞLANMAQ** 1. "Bağlamaq"dan *məch.* *Həyətin küncündə, çardağın altında bir çılpaq ağ at bağlanmışdı.* C.Məmmədquluzadə. *Bahadır atlar bağlanan yerə gedib gördü ki, Novruz xoruldayır.* N.Nərimanov. // Bitmək, bitmiş olduğu elan edilmək. *İclas bağlandı.*

2. *qayıd.* Qapanmaq, qıfıllanmaq, kilidlənmək. *Qapı bağlandı. Evdə bağlanıb bayıra çıxmamaq.*

3. *məc*. Vurulmaq, aşiq olmaq, məftun olmaq, bənd olmaq. *Füzuli zülfünə bağlandı, əmma öylə incəldi; Ki, guya zəf onu həm zülfünə bir tari-mu eylər.* Füzuli. *Nəriman qəlbi ilə nişanlısına nə qədər bərk bağlandığını düşündü.* Mir Cəlal.

**BAĞLANMIŞ** "Bağlanmaq"dan *f.sif. Bağlanmış qıfıl. Bağlanmış idarə. Bağlanmış yara. Sahilə bağlanmış qayıq. – Hər iki gözü möhkəm bağlanmış bu heybədə ya fəsəli, ya da qoz halvası olmalı idi.* M.Hüseyn.

**BAĞLAŞMA** *is.* 1. "Bağlaşmaq"dan *f.is.*

2. Müqavilənamə, şərtnamə. *Bildiyimiz kimi, bir neçə MTS üçün zavod bağlaşma ilə kənd təsərrüfat alətləri təmir etmişdi.* Ə.Əbülhəsən.

3. Qabaqcadan bağlanan müqavilələrə əsasən kənd təsərrüfatı məhsulatı tədarük etmə üsulu. *Kolxozlar bağlaşma planını yerinə yetirdilər.*

4. Qabaqcadan bağlanan müqavilə üzrə dövlət işinin hər hansı bir sahəsindən ötrü fəhlə və işçi toplama üsulu.

5. Mərcləşmə, mərc gəlmə, mərc.

**BAĞLAŞMAQ** *qarş.* 1. Şərtləşmək, bir-biri ilə şərt bağlamaq, müqavilə bağlamaq; şərt kəsmək. *Bu sözləri Cəlildən eşidəndə, haman adam dedi ki, yaxşı, mən razıyam, sabah gəl filan notariusun kontoruna, orada bağlaşaq.* İ.Musabəyov.

2. Deyişmək, şeirləşmək, beytləşmək.

3. Mərcləşmək.

**BAĞLATDIRMA** "Bağlatdırmaq"dan *f.is.*

**BAĞLATDIRMAQ** *icb.* İkinci şəxs vasitəsilə üçüncü şəxsə bağlatmaq.

**BAĞLATMAQ** *icb.* İkinci şəxs vasitəsilə bağlamaq.

**BAĞLAYICI** *is.* 1. Qrammatikada: cümlələri və ya cümlə üzvlərini bir-birinə bağlamaq üçün işlənilən köməkçi nitq hissəsi; məs.: və, ki, çünki, belə və s.

2. İki şeyi bir-birinə birləşdirən, bağlayan, əlaqələndirən vasitə və s.

**BAĞLI** *sif.* 1. İp, zəncir və s. ilə bağlanmış, rəbt edilmiş, bənd edilmiş. – *Bağlı aslana dovşanlar da hücum edər.* (Ata. sözü). // Məc. mənada. [Həsənin] *Dilaraya olan sevgisi həmişə bir əbədilik, daimilik hissi ilə bağlı idi.* M.İbrahimov. // Sarınmış, sarğılı. *Bağlı göz. Bağlı baş. Bağlı qıç.*

2. Qıfıllı, kilidli, qapalı, qapağı və ya qapısı örtülmüş. *Bağlı qapı. Bağlı sandıq. Bağlı şkaf. – Bağlı qapıya xata dəyməz.* (Ata. sözü).

3. Bağı, qaytanı olan; qaytanlı. *Bağlı tuman. Bağlı çəkmə.*

4. İşlənməz, keçilməz; hərəkətə yol verməyən, qabağına sədd çəkilmiş. *Bağlı yol. Bağlı qapı.*

5. Bitmiş, qurtarmış. *Sədr iclası bağlı elan etdi.*

6. B a x **qapalı** 5-ci mənada. *Bağlı iclas. Bağlı məktəb.*

7. *məc.* Asılı, əlaqədar, əlaqəli. *Məsələnin həlli böyük çətinliklə bağlıdır. Bu iş sənə bağlıdır.* – [Səfərəli:] *Xörəklərin yaxşı olması bağlıdır xərcə, xərc də bağlıdır nəqd pula.* N.Vəzirov. *Bahadırın atası qədim bəylərdən olub, dolanacağı ancaq mülklərinə bağlı idi.* N.Nərimanov. [Mustafa xan:] *Şəhərin zindəganlığı bağlıdır kəndlərə.* Ə.Haqverdiyev.

8. Bənd olmuş, vurulmuş; məftun. [Zalxa:] *Bəlkə qız səni sevmir? Ürəyi özgəsinə bağlıdır?* M.F.Axundzadə.

9. *is.* Kağız, parça və s. içərisinə qoyulub bağlanmış şeylər; düyünçə, boğça. *Qadın əlində böyük bir bağlı aparırdı.* M.S.Ordubadi. *Əl çamadanı boyda yüngülvari bağlını əlimə aldım.* Mir Cəlal.

**BAĞLI-BAĞATLI** *sif.* Bağları, yaşıllığı çox olan. *Mərənd .. bağlı-bağatlı və çox dadlı meyvələri olan bir yerdir.* M.İbrahimov. *Gözəl təbiətli bağlı-bağatlı Lənkəran onları* [artistləri] *böyük hörmətlə qarşıladı.* S.Rəhman.

**BAĞLI-BAĞÇALI** *sif.* Bağı, bağçası olan. *107 №-li ev bağlı-bağçalı bir hasarın lap dibində idi.* Mir Cəlal.

**BAĞLILIQ** *is.* 1. Bağlı şeyin halı.

2. *məc.* Asılılıq, əlaqədarlıq, əlaqəlilik.

**BAĞPƏRƏST** *is.* [*fars.*] Bağ işlərini, meyvə ağacları becərməyi çox sevən adam. *Ovurtdaq hesabdar kimi müqəssir durduğu yerdə, kim Əlisa kimi faydalı, bağpərəst, bağçapərəst, gülpərəst bir adamın adını belə-belə ləkəli şeylərdə çəkə bilər?* S.Rəhimov.

**BAĞRIBADAŞ** *is.* və *sif. dan.* Ürək dostu, çox yaxın, can bir qəlbdə. *Məktəb ilə bu millətin bağrıbadaşdı, qoymayın!* M.Ə.Sabir. [Hacı:] [Rəiyyət] *gəlib yanında izinsiz əyləşəcək, guya min ildir səninlə bağrıbadaşdı.* Ə.Haqverdiyev. ◻ **Bağrıbadaş olmaq** – çox yaxın olmaq, ürək dostu olmaq, can bir qəlbdə olmaq.

**BAĞRIBADAŞLIQ** *is. dan.* Çox yaxınlıq, dostluq, can bir qəlbdə olma.

**BAĞRIQARA**[1] *sif.* Kədərli, məhzun, halı pərişan, müsibət üz vermiş.

**BAĞRIQARA**[2] *is. zool.* Su kənarında yaşayan uzun qıçlı, döşüqara quş. *Bağrıqaranın qızardı bağrı; Şahbaz ona varanda doğru.* Xətayi.

**BAH** *nida.* b a x **ba.** *Bah, nə yekə canavardır! Bah, səni xoş gördük! Dünən az qala boğulmuşdum. – Bah!*

**BAHA** [*fars.*] 1. *is.* Dəyər, qiymət. *Çəkmənin bahası. Bahası on qəpiyə dəyməz.* – [Vəli:] *A kişi, olar ki, bir at bahası əlimizə düşə..* M.F.Axundzadə. *Bu sandıqda yüz min dinar bahasında daş-qaş, cavahirat vardır.* M.Hüseyn. // Əvəz, qarşılıq. [Mirzə:] *Məgər mənim imanımın bahası belə rəftardır?* Ə.Haqverdiyev.

2. *sif.* Yüksək qiymətlə satılan, ya alınan (*ucuz* ziddi). *Baha qiymət. Baha mal. – Bir aydan sonra o, bir gödək berdankanı çox baha qiymətə alıb, samanlıqda gizlətdi.* S.Rəhimov.

3. Yönl. halda: **bahasına** – bir şeyi əldə etmək üçün sərf edərək, qurban verərək. *O öz biliyini inadlı əmək bahasına qazanmışdır.* – [Azadın] *baqi qalan son dəqiqələri, onun hər nəfəsi bir düşmən həyatı bahasına tamam olur.* Ə.Məmmədxanlı. // Yolunda, uğrunda. *Qədəh bahasına can vermək istərəm, amma; Nə çarə kim, iki aləm olur bəhayi-qədəh.* S.Ə.Şirvani.

◊ **Baha oturmaq** – çox bahaya, böyük səy və zəhmətə mal olmaq, yaxud çox pis nəticələnmək, nəticəsi pis olmaq. [Əlyarov:] *Yazıqsan, bala, cavanlığını nəzərə alıram, yoxsa bu səhvin sənə baha oturardı.* M.Hüseyn. **Od (qızıl) bahasına** – çox baha, həddindən artıq baha qiymətə.

**BAHACIL** *sif.* Malını çox baha satan. [Xudayar bəy:] *Yaxşı, yaxşı, mən çoxdan bilirdim ki, sən bahacılsan.* C.Məmmədquluzadə.

**BAHAÇI** b a x **bahacıl.**

**BAHAÇILIQ** *is.* Bahaçı adamın xasiyyəti. *Mircümə ilə başqa qaçaqların bir fərqi vardısa, o da Mircümənin bahaçılığı idi.* P.Makulu.

**BAHADIR** *is*. [*fars.*] *tənt.* Qoçaq, igid, qəhrəman. *Bahadır deməzlər hərgiz sayana; Görüm lənət olsun yardan doyana.* M.P.Vaqif.

**BAHADIRLIQ** *is*. Qoçaqlıq, igidlik, qəhrəmanlıq. *Bahadırlıq göstərmək.*

**BAHALANDIRILMAQ** *məch.* Baha edilmək, qiyməti qaldırılmaq.

**BAHALANDIRMA** "Bahalandırmaq"dan *f.is*.

**BAHALANDIRMAQ** *f.* Qiymətini qaldırmaq, bahalaşdırmaq, yüksək qiymətə çıxarmaq. // Bahalığa, bir şeyin bahalanmasına səbəb olmaq, bahalıq salmaq.

**BAHALANMA** "Bahalanmaq"dan *f.is.*

**BAHALANMAQ** *f.* Qiyməti yüksəltmək, qiyməti baha olmaq; bahalaşmaq.

**BAHALAŞDIRILMAQ** b a x **bahalandırılmaq.**

**BAHALAŞDIRMA** "Bahalaşdırmaq"dan *f.is*.

**BAHALAŞMA** "Bahalaşmaq"dan *f.is.*

**BAHALAŞMAQ** *f.* Daha da baha olmaq; bahalanmaq.

**BAHALATMA** "Bahalatmaq"dan *f.is.*

**BAHALATMAQ** b a x **bahalandırmaq.**

**BAHALI** *sif.* 1. B a x **baha** 2-ci mənada. *Bahalı parça.* – [Gövhərin] *ağzı, içi bahalı daş-qaşla dolu bir mücrü kimi açıldı, sədəf kimi dümağ dişləri göründü*. Ə.Vəliyev.

2. *məc*. Nadir, çox az tapılan. *Platin bahalı filizdir.*

**BAHALIQ** *is.* Hər şeyin qiyməti çox yüksək olduğu vəziyyət. *Bahalıq düşmək. Bahalıq salmaq. – Bahalığın qabağını almaq üçün yeyinti şeylərini ucuz qiymətə satmaq lazımdır.* M.S.Ordubadi. [Pirqulu:] *..Bu bahalıqda dolana bilmərik. Ac adam işləyə bilməz.* C.Cabbarlı.

**BAHAR** *is*. [*fars.*] 1. İlin qış, yay arasında olan fəsli; yaz. *Bahar ayları. Bahar yağışı. Havadan bahar qoxusu gəlir* (yaz yaxınlaşır.) – *Qurbani der: bahar olur, gəlir yaz; Göllərdə üzüşür ördək ilə qaz*. Qurbani. *..Şairlər bahar fəslini hamıdan artıq dost tuturlar.* C.Məmmədquluzadə. *Arvadlarımız bahar girəndən sonra payızın axırınadək bağda, əkində gedib işləyirlər*. Ə.Haqverdiyev. ☐ **İlk bahar** *şair.* – yaz, yaxud baharın təravət saçan ilk çağı, ilk dövrü. *Gül üzünün çiçək açmış gülləri; İlk baharın müjdəsidir aləmə.* S.Vurğun. **Son bahar** *şair.* – payız. *Məktəbin həyətində son bahar yaşıllığının üstünə gəbə, kilim də döşənmişdi.* İ.Şıxlı. // Obrazlı təşbihlərdə. *Bülbüli-qəmzədəyəm, bağü baharım sənsən.* Füzuli. *Mənim bağım, baharım, həm gülüm, həm bülbülüm sənsən! Nə lazımdır mənə bağü baharü busitan sənsiz*. S.Ə.Şirvani. *Əyyami-baharü güldür, oğlum! Qoyma məni qəmdə, güldür, oğlum!* M.Ə.Sabir. *Yavrum, quzum, bahari-həyatın nə cür olar?* A.Səhhət. *O qartallı dağları sor, nə deyir: – Yüz min bahar gördüm, gəncəm, bax, yenə.* A.Şaiq. *Keçdi gəncliyimdən otuz beş bahar; Keçdiyim yollara baxdım bir daha*. S.Vurğun.

2. *məc. şair.* Gənclik; gəncliyin dadlı xəyal və arzularla dolu olan dövrünə işarədir. *Ömrünün bahar çağında.*

3. *məc*. Yaz havasını xatırladan, yumşaq, ılıq, açıq, mülayim hava haqqında. *Bayırda lap bahardır.*

**BAHARI** *is. köhn.* Keçmişdə: qısaqollu don, arxalıq.

**BAHARISTAN** *is*. [*fars.*] *şair*. b a x **bahar** 2-ci mənada. *Baharistani-ömrümdə tərənnümsaz olur bülbül; Həzari-naləkarəm, baği-aləm gülistanımdır*. M.Hadi.

**BAHARİYYƏ** *is.* [*ər.*] *əd.* Klassik Şərq ədəbiyyatında bahar mövsümünü vəsf və təsvir edən şeir. *Xətayinin bahariyyəsi.*

**BAHAROTU** *is. bot.* İlk baharda yetişən, çox xırda boylu bir bitki.

**BAH-BAH** b a x **bəh-bəh.**

**BAHƏM** *zərf* [*fars.*] *köhn.* Bir yerdə, birgə, birlikdə, bərabər. *Tut ağacının dibində .. samovarı qoydurdum və qonağımız ilə bahəm başladıq çay içməyə.* C.Məmmədquluzadə. *Aslan çox çalışqan olduğu üçün, hər gün öz ruzisini qazanıb, külfəti ilə bahəm bəxtiyar yaşayırdı*. C.Cabbarlı.

**BAHO** b a x **bah**. [Vaqif:] *Baho, xoş gördük, həmşəri! – deyə ona* [Kazıma] *pəncərənin içində yer göstərdi*. Çəmənzəminli.

**BAXAN** *f.sif.* 1. Nəzarət edən, idarə edən. *Dəftərxanaya baxan. Təchizat işlərinə baxan.* // Xidmət edən, qulluq edən, baxıcı. *Malqaraya baxan. Xəstəyə baxan*.

2. Qoşulduğu sözün göstərdiyi tərəfə açılan, həmin səmtə doğru yönəldilmiş, yaxud mövqe tutmuş. *Şahnisə xanımın Dabtələb*

*və Xəlfəli meşəsinə baxan bir otağı vardı.* Çəmənzəminli. *Sanki balkona baxan camların dalısında yüzlərcə adam durmuş*(*du*). M.S.Ordubadi. *Təki ayaq kəsməsin könül mülkündən ilham; Üzü günəşə baxan otağım mənə bəsdir.* Ə.Cəmil.

**BAXAR** *is.* 1. B a x **axar-baxar.**

2. Açıq yer, mənzərə. *Yolun o tərəfi baxarında qara boz alaçıqlar və qübbəli ağ çadırlar qurulmuşdu.* S.Rəhimov.

**BAXARLI** b a x **axar-baxarlı.**

**BAXÇIVAN** *köhn.* b a x **bağban.**

**BAXDIRMA** "Baxdırmaq"dan *f.is.*

**BAXDIRMAQ** *icb.* 1. Baxmağa məcbur etmək, baxmağa icazə vermək; göstərmək.

2. Müraciət etdirmək. *Kitabın müqəddiməsinə baxdırmaq.*

**BAXƏBƏR** *sif.* [*fars.* ba... və *ər.* xəbər] *köhn.* Xəbərdar, xəbəri olan, məlumatı olan. *Dünyagörmüş adamlar, məmləkət gərdişindən baxəbər şəxslər belə bir qayda qoymuşlar..* Çəmənzəminli. ◻ **Baxəbər olmaq** – xəbərdar olmaq. *Qıraq kəndlilərdən də camaat baxəbər olub, yavaş-yavaş gəlirdilər.* C.Məmmədquluzadə. *Olub ta ki, Kavus-Key baxəbər; Buyurdu, açıldı livayi-zəfər.* M.Ə.Sabir.

**BAXICI** *is.* 1. Baxan, nəzarət edən, idarə edən. *Yol baxıcısı. Həbsxana baxıcısı. – Cəlil ağa Avropaya gedəndə onun dövlətinin və işlərinin üstünə gərək ya bir baxıcı .. və ya bir icarədar olaydı.* İ.Musabəyov. *Haşım .. az bir zamanda fəhləlikdən çıxıb, Hacı Məhəmmədin cəmi işlərinə baxıcı oldu.* B.Talıblı.

2. Qulluq edən, xidmətçi. *Xəstə baxıcısı.*

3. Tamaşaçı.

4. *dan.* Falçı, falabaxan.

**BAXICILIQ** *is.* 1. Baxmaq işi, nəzarətçilik, gözətçilik.

2. Falçılıq, fala baxma.

**BAXILIŞ** *is.* Baxmaq işi və tərzi. *Bu gün yeni pyesin baxılışı olacaqdır.*

**BAXILMA** "Baxılmaq"dan *f.is.*

**BAXILMAQ** *məch.* 1. Tamaşa edilmək, gözdən keçirilmək, seyr edilmək. *Yeni filmlərə baxılmaq.*

2. Mütaliə edilmək, göz gəzdirilmək, gözdən keçirilmək, ötəri oxunmaq. *Qəzetlərin bugünkü nömrələrinə baxılmışdır.*

3. Gözdən keçirilmək, axtarılmaq, araşdırılmaq. *Hər tərəfə baxılmışdır.* // Yoxlanılmaq. *Korrekturaya yaxşı baxılmamışdır.*

4. Fikir verilmək, əhəmiyyət verilmək, diqqət yetirilmək, nəzərə alınmaq, qulaq asılmaq. *Məsləhətə baxılsaydı, belə olmazdı.*

5. Müzakirə edilmək, gözdən keçirilmək. *Məhkəmədə işə baxılmaq.*

6. Qulluq edilmək, xidmət edilmək, qayğısı çəkilmək. *Mal-qaraya yaxşı baxılmaq.*

**BAXIM** b a x **baxış** 1 və 2-ci mənalarda. ◻ **Bir baxımda** – baxan kimi. [Miçurin] *bir baxımda bitkinin nəinki indiki vəziyyəti, hətta gələcəyi haqqında belə hökm edə bilərdi.* M.F.Axundzadə. **Bu baxımdan** – bu nöqteyi-nəzərdən. *Bu baxımdan onun fikri doğrudur.*

**BAXIMLI** *sif.* 1. Yaxşı baxılmış, yaxşı qulluq edilib kökəldilmiş; kök (heyvan haqqında).

2. Yaraşıqlı, gözəl (adam, ya heyvan haqqında). // Baxmalı, mənzərəli. *Baxımlı yer.*

**BAXIMSIZ** *sif.* 1. Evsiz, sahibsiz, başsız qalmış, küçədə qalmış, baxanı olmayan; nəzarətsiz. *Baxımsız uşaq.*

2. Yaxşı baxılmamış, yaxşı qulluq edilməmiş; başlı-başına buraxılmış. *Cuma baxımsız qalmış bağ-bağçalara göz yetirirdi.* Ə.Əbülhəsən.

**BAXIMSIZLIQ** *is.* Baxımsız şeyin halı; sahibsizlik, başsızlıq, nəzarətsizlik. *Uşaq baxımsızlığı ilə mübarizə. Baxımsızlıq üzündən bitkilər yaxşı inkişaf etmir. – Yaz ağzı əkilən göyərtilər də baxımsızlıqdan qurumuşdu.* S.Rəhimov.

**BAXINMA** "Baxınmaq"dan *f.is.*

**BAXINMAQ** *qayıd.* Ətrafına baxmaq, yanyörəsinə baxmaq. *Qaranlıqda çox baxındım sağ-sola; Hər yana buruldum, ey dan ulduzu!* C.Cabbarlı. *Qadın əvvəlcədən belə bir işarə gözləyirmiş kimi, ətrafına baxındı. Mənə tərəf gəldi.* Mir Cəlal. *Eldar .. çaşqınçaşqın ətrafına baxındı.* Ə.Məmmədxanlı.

**BAXIŞ** *is.* 1. Baxmaq tərzi, gözlərin ifadəsi; nəzər. *Bu necə baxışdır? Acıqlı baxış. Xumar baxışlar. – Süzülmüş gözlərin sağü salamət; Və lakin baxışı bimarə bənzər.* Nəsimi. *Ahu baxışı, qara gözü can alır əldən.* S.Ə.Şirvani. *Sizin istər baxışınız, yerişiniz,*

*istər əlbəsəniz və qiyafəniz elə təsir bağışlayırdı ki, mühitin ruhunu təhlil etmiş, onun məfkurəsini mənimsəmişsiniz*. S.Hüseyn. *Duruşun mənalı, baxışın dərin; Mən bu dərinlikdə tapdım bəxtimi.* M.Müşfiq. ☐ **Baxış atmaq** – nəzər salmaq, baxmaq. *Hambal son dəfə arvada şikayət, məhəbbət və dərd dolu bir baxış atdı.* S.Rəhman. **Baxış vermək** – baxmaq, nəzər salmaq. *Məryəm bu çağacan kimsəyə, heç bir oğlana və ya da kişiyə bir baxış verməmişdi*. B.Talıblı. **İlk baxışda** – ilk təəssürata görə, ilk təsirə görə. // Göz, nəzər. *Xalçaların butası; Qamaşdırır baxışı*. M.Seyidzadə.

2. *məc*. Görüş, fikir, mülahizə, nöqteyinəzər. *İctimai-siyasi baxışlar. Meşşancasına baxış. – Bu baxışlar Nadiri dəli edib çöllərə salır və bir neçə günlük işdən avara qoyurdu.* B.Talıblı.

3. *məc*. İctimai yoxlama, təntənəli surətdə gözdən keçirmə, tanış olma. *Bakı şəhərində tikiləcək binalar üçün hazırlanmış layihələrin ictimai baxışı və müzakirəsi təşkil edilmişdir.*

**...baxışlı** *şair.* Adətən başqa sözə qoşularaq, tərkib halında mürəkkəb sifət kimi işlənilir; məs.: ceyranbaxışlı, ahubaxışlı və s. *Ovçunu görəndə maralbaxışlı; Ay üzü birçəkli, xallı Sənəm, gəl.* Xəstə Qasım. *Xanın bütün diqqəti yuxarı başda əyləşmiş qartalburunlu, şahbazbaxışlı .. Ömər xanda idi*. Çəmənzəminli. [Mehriban xanım] *gah şıltaq bir qız, gah ceyranbaxışlı bir gəlin, sonra da indiki kimi küsəyən bir uşağabənzər qarı şəklində dayanıb durur*. S.Rəhimov.

**BAXIŞMA** "Baxışmaq"dan *f.is.*

**BAXIŞMAQ** *qarş*. Bir-birinə baxmaq. *Qaraca qız və Ağca xanım nəzərlərini bir-birinə salıb, bir müddət diqqətlə baxışdılar*. S.S.Axundov. [Sevənlər] *bir-birini gördükdə susur, gözaltı baxışır, ah çəkir, təklikdə ağlayır, xəyala dalırdılar.* M.İbrahimov.

**BAXMA** "Baxmaq"dan *f.is*.

**BAXMADAN** *zərf* Baxmayaraq, fikir vermədən, nəzər salmadan. *Baxmadan ötüb keçmək. Geriyə baxmadan qaçdı*.

**BAXMAQ** *f.* 1. Bir şeyi görmək üçün gözlərini ona dikmək, nəzərini bir şeyə dikmək, nəzər yetirmək. *Şəklə baxmaq. Pəncərədən baxmaq. Diqqətlə baxmaq. Ətrafına baxmaq. Güzgüyə baxmaq. Haraya baxırsan? – Sultan bu sözlərdən sonra Bahadıra baxıb, onun bu barədə sözünü kəsdi.* N.Nərimanov. ☐ **Qabağa (irəliyə) baxmaq** – gələcəyi görmək, nəzərdə tutmaq.

2. Tamaşa etmək, gözdən keçirmək, müşahidə etmək, seyr etmək. *Kinoya baxmaq. Şəklə baxmaq. Bu mənzərəyə baxdıqca, insanın könlü açılır. – Yorğun Rüstəm daşa söykənir, üfüqə baxa-baxa* (z.) *yuxuya gedir*. S.Rəhimov.

3. Mütaliə etmək, ötəri oxuyaraq, ya göz gəzdirərək tanış olmaq, gözdən keçirmək; tanış olmaq. *Kitaba baxmaq. Qəzetə baxmaq.* // Öyrənmək, oxumaq, məşğul olmaq. *Dərslərinə baxmaq.* // Yoxlamaq, gözdən keçirib düzəltmək, təshih etmək. *Əlyazmalarına baxmaq. Şagirdlərin dəftərlərinə baxmaq. Korrekturaya baxmaq.*

4. Göz gəzdirmək, axtarmaq, araşdırmaq. *Yaxşı bax taparsan. Hər yerə baxdım, tapa bilmədim*.

5. Yoxlamaq, müayinə etmək. *Nəbzinə baxmaq. Hərarətinə baxmaq. İsti-soyuqluğuna baxmaq.*

6. Birindən nümunə götürmək, ibrət götürmək, özünü ona oxşatmaq, fikir vermək. *Yoldaşlarına bax, özünü düzəlt. Sən ona baxma, öz ağlınla iş gör!*

7. Fikir vermək, əhəmiyyət vermək, diqqət yetirmək, nəzərə almaq, qulaq asmaq, hesablaşmaq. *Deyilənlərin heç birinə baxmadı. Edilən göstərişlərə baxsaydı, belə olmazdı. – Səcdə qıl yarə, könül, baxma o zahid sözünə.* S.Ə.Şirvani. [Məhəmməd Ağa:] *Ay kişi, özgənin sözünə nə üçün baxırsınız.* N.Nərimanov. [Mirzə Fətəli:] *Amma oğlum, nəvələrim də görsələr mənə hesabdır; camaatın avamlığına baxma.* Ə.Haqverdiyev. *Ağrın alım, sözə bax, evimizdə səndən savay gör; Heç varmı bir oyaq?* Ə.Cəmil.

8. Bir şey haqqında müəyyən rəyi, fikri, mülahizəsi olmaq; bir münasibət göstərmək, qiymətləndirmək, hesab etmək, saymaq. *Sən bu məsələyə necə baxırsan? Bu işə sadə bir iş kimi baxmaq olmaz. Mən ona bir alim kimi baxıram. – Ona* [Əsədə] *sabah yoldaş-*

*ları necə baxacaqlar, cürətli və doğruçu deyib, ehtiram edəcəklərmi?* B.Talıblı.

9. Müzakirə etmək, gözdən keçirmək. *İclasda hansı məsələlərə baxacaqlar? Məhkəmə bu gün işə baxacaqdır.*

10. Ölçüb-biçmək, yoxlamaq, fikirləşmək, düşünmək, mülahizə etmək. *Baxaram, vaxtım olsa, gələrəm. Baxarsan, xoşuna gəlsə, alarsan.*

11. Qulluq etmək, xidmət etmək, qayğısına qalmaq, təmin etmək. *Xəstəyə baxmaq. Atlara baxmaq.* // Nəzarət etmək, göz qoymaq, göz-qulaq olmaq; üstündə gözü olmaq, qarovul çəkmək. *Uşaqlara baxmaq. Sürüyə baxmaq.* // İdarə etmək, başçılıq etmək, müdirlik etmək. *Bu işlərə kim baxır?*

12. Müalicə etmək, tibbi cəhətdən nəzarət etmək, müayinə etmək. *Xəstəyə hansı həkim baxır?*

13. Müəyyən tərəfə yönəldilmək, çevrilmək, döndərilmək, açılmaq. *Evin pəncərələri həyətə baxır. Topların ağzı dənizə baxır. Binanın ön tərəfi şimala baxır.*

14. *dan.* Asılı olmaq, bağlı olmaq, əlaqədar olmaq, tabe olmaq. *Məsələnin həlli əksəriyyətə baxır. Bu iş sənə baxır. O baxır sənin fərasətinə. – Demək olar ki, kəndin bütün mədəni-maarif işləri ona baxır.* "Kirpi".

15. Əmr şəklində: **bax** – təkid, hədə, xəbərdarlıq, qəti tapşırıq bildirir, yaxud diqqəti deyilən sözə cəlb etmək üçün işlənir. *Bax, gecikmə, ha! Bax, ehtiyatlı ol! Bax, mənim fikrim budur. Bax, qoçaqlıq buna deyərlər. – Xan qəti bir səslə: – Düzünü de görüm, necə oldu? – dedi .. Bax, birini* [Xanməmməd] *altdan-üstdən desən, başın cəllad əlindədir.* Çəmənzəminli. [Xavər:] *Özünü gözlə, bundan sonra sən mənim üçün də olmasa, bax, bu balaca üçün özünü gözləməlisən.* M.İbrahimov.

16. Bir sıra isimlərə qoşularaq, mürəkkəb feillər və müxtəlif ifadələr düzəldilir; məs.: fala baxmaq, ağıza baxmaq, barmaqarası baxmaq, əyri baxmaq, yan baxmaq.

**BAXMALI** *sif.* Baxmağa, tamaşa etməyə dəyən, tamaşaya layiq olan, görməli, maraqlı. *Baxmalı şəkil. Baxmalı şey. Baxmalı tamaşa. Baxmalı yerlər.*

**BAXMAYARAQ** *f. bağ.* Əksinə olaraq, ziddinə olaraq; nəzərə almayaraq. *Bərk yağış yağdığına baxmayaraq, hava isti idi. Qocalığına baxmayaraq, çox qıvraqdır. – Nadirin israr etməsinə baxmayaraq, Məcid ona bir söz demədi..* B.Talıblı.

**BAXŞI** *is.* Bir sıra türk xalqlarında (özbək, qazax, qırğız, uyğur, türkmən və qaraqalpaq) mahnılarını simli çalğı aləti dütarın müşayiəti ilə oxuyan şair-nəğməkar.

**BAXTA** b a x **alabaxta.**

**BAXTALAMA** "Baxtalamaq"dan *f.is.*

**BAXTALAMAQ** *f.* 1. Qumarda uduzmaq. [Xortdan:] *Sənin bankda nə qədər pulun var, hamısını baxtaladı.* Ə.Haqverdiyev.

2. *məc.* Ümumiyyətlə, uduzmaq, itirmək, əldən çıxarmaq.

**BAXTALANMA** "Baxtalanmaq"dan *f.is.*

**BAXTALANMAQ** *məch.* Uduzulmaq.

**BAXTALATMAQ** *icb.* Baxtalamasına, uduzulmasına səbəb olmaq.

**BAXYA** *is.* Xırda, sıx tikiş. ☐ **Baxya vurmaq (getmək)** – b a x **baxyalamaq. Baxya iynəsi** – 1) incə və kiçik dərzi iynəsi; 2) cərrahlıqda işlənən xüsusi iynə, cərrah iynəsi.

◊ **Baxya tutmaq** – bir işdə, ya yerdə möhkəmlənmək, sabitləşmək, qərar tapmaq. **Baxyanı üzə vurmaq** – gizli bir şeyi aşkara çıxarmaq, işin üstünü açmaq.

**BAXYALAMA** "Baxyalamaq"dan *f.is.*

**BAXYALAMAQ** *f.* 1. Bir şeyi xırda və ya görünməz tikişlə tikmək. *Paltarın ətəyini baxyalamaq. – Qadın tikdiyi köynəyin döşünü baxyalayırdı.* Ə.Əbülhəsən.

2. Yaranın ağzını xüsusi iynə və sapla tikib bitişdirmək.

3. *dan.* Gizlətmək.

4. *məc. dan.* Uydurmaq, özündən toxumaq.

**BAXYALANMA** "Baxyalanmaq"dan *f.is.*

**BAXYALANMAQ** *məch.* Baxya vurulmaq.

**BAXYALI** *sif.* Xırda və möhkəm tikişli, sıx tikişli, baxyası olan. *Baxyalı paltar.*

**BAİNHƏMƏ** *bağl.* [*fars.*] *köhn.* Bununla bərabər, bununla belə. [Həkimbaşı] *doğrudur, hacıya qızının mərəzinin nə olduğunu bilmədiyini söylədisə də, bainhəmə mərəzin nə olduğunu gözəlcəsinə anlamışdı.* Ə.Haqverdiyev.

**BAİS** *is*. [*ər.*] Səbəb. *Gər İbni-Səlam idi bəhanə; Məcnun idi bais ol fəğanə*. Füzuli. [Hacı Nuru:] *Hər kəsin öz sənəti özünə iksirdir və xoş güzəranlığına baisdir*. M.F.Axundzadə. ☐ **Bais olmaq** – səbəb olmaq. *Bais nə oldu, ey güli-rəna, ki görmürəm; Əvvəlki iltifatlarından əsər sənin?* S.Ə.Şirvani. [Güldəstə:] *Camaat arasında danışıq var ki, onun ölməyinə bais siz olmusunuz*. N.Nərimanov. *Atlar da, deyəsən, sahiblərinin iftixarına bais olduqlarını, duymuşdular*. Mir Cəlal. // Səbəbkar, səbəb olan adam. [Arvad:] *Bais, evin dağılsın!..* C.Məmmədquluzadə. *Oxuyun, millətin nicatı olun; Ta əbəd baisi-həyatı olun!* M.Ə.Sabir. [Səriyyə:] *Bu işlərin də baisi Həmzə ilə anamdır*. C.Cabbarlı.

**BAİSKAR** *sif*. [*ər.* bais və *fars.* ...kar] Bais olan, səbəb olan, səbəbkar.

**BAİSKARLIQ** *is*. Bais olma, səbəb olma, səbəbkarlıq.

**BAİSLİK** b a x **baiskarlıq.**

**BAK** [*fr.*] İçinə maye tökmək üçün ağzı örtülü böyük qab. *Benzin bakı. Su bakı. – Bu dəfə Heybət .. başını aşağı saldı və qabı yerdən götürüb, baka neft tökdü*. M.Hüseyn.

**BAK** *is*. [*fars.*] *klas.* Qorxu, xof. *Sən mənimlə dust olsan, cövri-düşməndən nə bak?* Xətayi. *Dövran həvadisindən yox bakimiz, Füzuli; Darüləmanımızdır meyxanələr bucağı*. Füzuli. *Bu bir, iki, üç məsələdə yox o qədər bak; Olsun, bəcəhənnəm, necə rəftar olacaqdır*. M.Ə.Sabir. ☐ **Bak e(y)ləmək** – qorxmaq. *İndi rüsvayi-cahan oldum, nədən bak eylərəm*. M.Ə.Sabir.

**BAKÁL** [*fr.*] İri qədəh, içki piyaləsi. [Semyon:] *Yenə də səslənir gümüş bakallar...* S.Vurğun. // Qədəhə tökülmüş içki mənasında; badə. [Kassir:] *Bu bakalı içək, yoldaş, necə ki, mən xahiş eləyirdim, .. içilsin*. Mir Cəlal.

**BAKALAVR** *is*. [*lat.*] Ali məktəblərdə təhsilin dördillik ilk mərhələsi.

**BAKENBÁRD** *is*. [*alm.*] *köhn.* Buxaq qırxılmaqla üzdə saxlanan saqqal və yarımsaqqal.

**BAKENBARDLI** *sif.* Bakenbard qoymuş (b a x **bakenbard**). *İçəriyə boz kolenkor döşlüklü, qaşqabaqlı, bakenbardlı, üzüqırxıq ağır bir lakey daxil oldu*. Tolstoydan.

**BAKİR(Ə)LİK** *is*. Qızlıq, saflıq, təmizlik.

**BAKİR(Ə)** *sif.* [*ər.*] 1. Pozulmamış, toxunulmamış. *Bakirə qız*.

2. *məc*. Saf, təmiz, korlanmamış, ləkəsiz. *Bu incə rəqslərdə nə qədər gözəllik, nə qədər bakir hissin ifadəsi vardı*. Çəmənzəminli. [Uşaqların] *saf, bakir, həyat və gələcək dolu şən səsi dillərin ən böyük mahnısı, .. dünyanın ən dadlı musiqisidir*. Mir Cəlal.

3. *məc*. İnsan əli dəyməmiş, toxunulmamış. *Bakir meşələr. – Birinci dəfə Nobel, adanın bakir torpağını ilk kəşfiyyat buruğu ilə zədələrkən çox məyus olmuşdu*. Ə.Məmmədxanlı.

**BAKTERİOLÓGİYA** [*yun.*] Bakteriyalardan bəhs edən elm; mikrobiologiya.

**BAKTERİOLOJİ** *sif.* 1. Bakteriologiyaya aid olan. *Bakterioloji institut. Bakterioloji tədqiqat. Bakterioloji analiz.*

2. Xəstəlik törədən bakteriyalar tətbiqinə aid olan. *Bakterioloji silah. Bakterioloji müharibə.*

**BAKTERİÓLOQ** [*yun.*] Bakteriologiya mütəxəssisi.

**BAKTÉRİYA** [*yun.*] Xəstəlik törədən mikroskopik (adi gözlə görünməyən) birhüceyrəli orqanizm; mikrob. *Xəstəliktörədici bakteriyalar. Vəba bakteriyası.*

**BAQÁJ** [*fr.*] Nəqliyyat vasitəsilə daşınılan şəxsi yüklərin ümumi adı. *Vağzalın baqaj şöbəsi. Baqaj kassası.* – [Gülpəri] *cəld nökəri Cəfəri göndərib, iki nəfər hambalı çağırtdı, yanındakı və baqajdakı şeyləri daşıyıb, ikinci klas salonunda yığdırdı.* S.S.Axundov. // Sərnişindən ayrı olaraq göndərilən şey haqqında. [Məsum kişi] *pal-paltarını bağlayıb, baqaja verdi.* Mir Cəlal.

**BAQAJÇI** *is*. Dəmir yolunda və s.-də baqaj qəbul edən işçi.

**BAQAJLIQ** *is*. Minik maşınlarında, motosikletlərdə və s. nəqliyyat vasitələrində baqaj qoymaq üçün xüsusi yer.

**BAQİ** *sif.* [*ər.*] 1. Daimi, əbədi. ☐ **Baqi etmək** – daimiləşdirmək, əbədiləşdirmək. *Məcmuəmizin naqqaşı səni görən kimi gözəl surətini məcmuəmizə salıb, sənin ismü rəsmini baqi və yer üzündə məşhur olmağına ciddi-cəhd edərdi.* C.Məmmədquluzadə. **Baqi qalmaq** – davam etmək, yaşamaq.

// Xəbər şəkilçisi ilə: **baqidir** – qalmışdır, hələ də vardır, davam edir, yaşayır. *Hələ baqidir yerində köhnə qaydalar, adətlər.* R.Rza.

2. Qalan, artıq. *Pulun baqisi. – Gətir saqi, meyi-baqi, bu bəzmi eylə bir rövşən.* Nəbati. [Azad] *durmadan ataş açır, onun baqi qalan son dəqiqələri, onun nəfəsi düşmən həyatı bahasına tamam olur.* Ə.Məmmədxanlı.

**BAQQAL** *is.* [*ər.*] *köhn.* Keçmişdə ərzaq malları satan dükançı. *Baqqal ölənin borcunu dirilərə yüklər.* (Ata. sözü). *Novruza bir həftə qalmış baqqal dükanlarının qabağını ayna, xalça və cürbəcür şəkillərlə bəzərdilər.* H.Sarabski. [Kürd Əhməd:] *Bu işdə kargər də, kəndçi də, ziyalı da, istəsəniz baqqal da bir cəbhədə olmalıdır.* M.İbrahimov.

**BAQQALİYYƏ** *is.* [*ər.*] 1. Baqqal dükanında satılan mallar: çay, qənd, un, düyü, quru meyvə və i.a.

2. Bu cür şeylər satılan mağaza, dükan.

**BAQQALLIQ** *is. köhn.* Baqqal sənəti. *Baqqallıq etmək.*

**BAL**[1] *is.* 1. Arıların çiçək və meyvə şirəsindən hasil etdikləri qatı şirin maddə. *Şan balı. – Bal tutan barmaq yalar.* (Ata. sözü). [Piri kişi:] *Ağca xanım, bu pətəyi sənin adına saxlayacağam, .. haçan könlün bal istədi, gələrsən, kəsib verərəm.* S.S.Axundov. ☐ **Bal arısı** – bal hasil edən arı. *Hərdənbir bal arılarının .. vızıltısı eşidilirdi.* Ə.Vəliyev. **Ana balı** – qoca arıların hasil etdikləri bal (beçə balına nisbətən rəngi tutqun olur). **Beçə balı** – cavan arıların hasil etdiyi bal. **Qoca balı** – b a x **ana balı. Şəhd balı** – şandan çıxarılan mumsuz bal.

2. *məc.* Çox şirin, çox dadlı, çox ləzzətli şey haqqında. *Armud deyil, baldır. Bal kimi* (çox şirin).

◊ **Ağzından bal tökülmək** – çox şirin sözlər danışan adam haqqında.

**BAL**[2] *is.* [*fars.*] *klas.* Qanad. Klassik ədəbiyyatda çox vaxt "balü pər", yaxud "pərü bal" şəklində işlənir – qol-qanad. *Cida düşdüm o tuti ləhcədən, balü pərim sındı.* S.Ə.Şirvani. [Cəfərqulu xan:] *Atamızın qoşunu tərk olub, balü pəri qırılandan sonra bir yerdə Ədil şaha əsir olmuşuq.* Ə.Haqverdiyev. *Döyüşdükcə qoca qartal; Qüvvət alır balü pəri.* S.Vurğun. *O yazıq quşların balü pərini .. kəsmişdilər.* M.Rahim. ☐ **Balü pər vermək** *klas.* – qanadlandırmaq, ruhlandırmaq. *Öz asar və əşarı ilə onlar* [ədib və şairlər] *millətin cisminə şəfa, ruhinə səfa, fikrinə cila, əqlinə və mənəvi və ruhani qüvvələrinə balü pər verib, uca məqamə qaldırırlar.* F.Köçərli.

**BAL**[3] [*fr.*] Böyük rəqs gecəsi. *Bir azdan sonra musiqi gurladı, zalın qapıları açıldı və bal başlandı.* Puşkindən.

**BAL**[4] *is.* [*ər.*] *köhn.* Ürək, qəlb, könül.

**BAL**[5] *is.* [*ər.*] *köhn.* 1. Fikir, düşüncə.

2. Yaddaş, hafizə.

3. Xatirə.

**BAL**[6] *is.* [*ər.*] *köhn.* Böyük ağır çəkili su məməlisi; balina.

**BAL**[7] *is.* [*fr.*] 1. Çeşidli təbiət hadisələrinin (küləyin, zəlzələnin və s.) gücünün ölçü vahidi.

2. Təhsil müəssisələrində bilik, əxlaq, çalışma dərəcəsini bildirən qiymət və ya qəbul zamanı alınan qiymətlərin məcmusunu göstərən rəqəm.

**BALA** 1. *is.* Övlad, uşaq, oğul. *Ana və bala. Balalara hədiyyə. – Bala baldan şirindir.* (Ata. sözü). *Biçarə Məşədi Əsgər indi üç gün idi ki, gözüyaşlı ac-acına balalarının əhvalına alışırdı.* S.M.Qənizadə. [Ana:] *Qulaq asın, mənim balalarım, ürəyimə damıb ki, mən bu yataqdan durmayacağam.* M.İbrahimov. // Məc. mənada. [Baş leytenant:] *Qafqaz balası, bu körpü cəbhənin mühüm keçidlərindəndir.* Mir Cəlal.

2. Kiçik, körpə heyvan, quş. *Pişik balası. Tülkü balası. Qarğa balası. – Gah yetişmiş meyvələri dərib yeyərdik, gah quş yuvalarından bala düşürüb oynardıq.* S.S.Axundov. ☐ **Bala vermə** – heyvanların bala doğma qabiliyyəti. **Bala salma** – balanın vaxtından əvvəl doğulması, abort.

3. Xitab yerində (çox vaxt "a balam", "ay balam", "balam" şəklində də işlənir). *Papaqçı dedi: – Bala, mənə şəyird durarsanmı? Rəsul dedi: – Nə üçün durmaram.* "Aşıq Qərib". *Ay balam, eybini qan; Bir həya eylə, utan!* M.Ə.Sabir. [İsmayıl ağa:] *Balam, nə olar bizləri də yada salasan! Üç gündür eşitmişəm buradasan, di gəl, tapa*

*bilmirəm*. Mir Cəlal. [Xeyransa:] *A balam, deyirəm bir kişiyə məsləhət eləyim, sonra gedək*. H.Sarabski.

4. *sif.* Kiçik, balaca, xırda, körpə. *Tamam ağ bədənin güldən əladır; Qamətindir sənubərdən, bala qız*. M.P.Vaqif. *Aristokratiya xanımları, yenə də gözəl bala dərvişin şəklini .. öpür.* M.S.Ordubadi. *Xan Sultan qoyunu gözləmək üçün bala çobanı dik qayanın başına qaldırmışdı.* S.Rəhimov.

**bala-bala** *zərf dan.* Yavaş-yavaş, az-az, ahəstə-ahəstə.

**BALABACI** *is. dan.* Qohum-əqrəba arasında hörmət üçün kiçiklər tərəfindən böyüklərə (qadınlara) müraciət (ad çəkməmək üçün işlənən söz).

**BALABAN** *is.* Nəfəslə çalınan qamışdan, ağacdan qayrılan sadə çalğı aləti; düdük, tütək. *Döyüldü təblü naqarə, çalındı ney, balaban.* A.Səhhət. *Anası dinməz-söyləməz bunun* [Həsənin] *başının altından götürüb gizlətdiyi balabanı yenə də özünə qaytardı.* B.Talıblı. □ **Yastı balaban** – balabanın zərif səsli növü. *Orkestrin tərkibində: tar, kamança, saz* (*simli alətlər*)*; yastı balaban, tütək* (*nəfəsli alətlər*)*; nağara, qaval* (*zərb ilə çalınan alətlər*) *kimi Azərbaycan xalq çalğı alətləri vardır.* Ə.Bədəlbəyli.

◊ **Balabanda qandırmaq** *dan.* – söz arasında incə işarələrlə başa salmaq.

**BALABANÇALAN, BALABANÇI** *is.* Balaban çalan, tütək çalan. *Aşıq Cəfər əlində saz, balabançı ilə çuxalarını çıxarıb durdular ayağa.* Ə.Haqverdiyev. *Dəfçalan, zurnaçı, balabançı, mütrüb də manqalın başında oturardı*. H.Sarabski.

**BALABANÇILIQ** *is.* Balabançının işi, sənəti.

**BALABİBİ** *is. məh.* 1. Kiçik bibiyə verilən ad.

2. Gəlinlərə verilən ləqəb; gəlinciyəz.

**BALACA** *sif.* 1. Həcmcə, boyca, ölçücə kiçik, xırda (*böyük* müqabili). *Balaca barmaq. Balaca bina. Balaca otaq. Balaca qutu. Balaca adam. Balaca ağac. – Məcid indi torpaq payını almış və özünə balaca təsərrüfat düzəltmiş bir kəndli idi.* B.Talıblı. *Məhəccər boyu dairə şəklində balaca bostanın dövrəsini bürümüş gül-çiçək elə uzaqdan da qızarışırdı*. M.Hüseyn. *Qocanın balaca pəncərəsi qalın meşəyə tərəf açılırdı*. S.Rəhimov. *İndi bu balaca kəndciyəz Dilara üçün ... Bakı qədər əzizdir.* Ə.Məmmədxanlı.

2. Sayca, miqdarca az, azacıq, cüzi. *Balaca dəstə. Balaca bir məbləğ ayırmaq.*

3. Azyaşlı, xırdaca, kiçik. *Balaca qız hələ məktəbə getmir. – Balaca, yastıburun .. Zivər gəlib, Kərimin qucağında oturdu.* M.İbrahimov. // *İs. mənasında.* Uşaq. *Balacanı bazara göndər. Bəs balaca haradadır? Balacanı da özümlə aparacağam. Balacanın neçə yaşı var?* // Balaca uşağa müraciət. *Balaca, bir bəri bax!*

4. Əhəmiyyətsiz, cüzi, yüngülvari; bir qədər, bir az. *Balaca dəyişiklik. Balaca rol. Balaca narazılıq. Mənə balaca soyuq dəyibdir. Aramızda balaca mübahisə oldu. Balaca bir iş üstə küsüşdülər*. // Zərf mənasında. *Balaca tərləmək. Balaca yeyib, içdik. Balaca gözlə*.

5. Bəzən bir sözü ilə: **bir balaca** – azacıq, bir az, bir qədər. *Bir balaca gözlə. Sənə bir balaca sözüm var. Sizə bir balaca işim düşüb.*

**balaca-balaca** 1) *zərf* Yavaş-yavaş, xırda-xırda, ahəstə-ahəstə, az-az. *Naxoşdum, indi balaca-balaca gəzirəm;* 2) *sif.* kiçik-kiçik, xırda-xırda. *Balaca-balaca uşaqlar.*

**BALACABOY** *sif.* Boyu alçaq, xırda. *Balacaboy oğlan.*

**BALACACIQ** *is*. Kiçicik. *Xidmətçi arvad tələsik ona balacacıq, bükülü bir kağız uzatdı.* Ə.Əbülhəsən.

**BALACALANDIRMA** "Balacalandırmaq"-dan *f.is.*

**BALACALANDIRMAQ** bax **balacalaşdırmaq.** [Qara] *özlüyündə belə deyirdi ki, .. yoxsa indiki zamanda at minmək desən heç raykom katibinə yaraşmır. Bəlkə də bu iş onu xırdalandırır və balacalandırır.* S.Rəhimov.

**BALACALANMA** "Balacalanmaq"dan *f.is.*

**BALACALANMAQ** bax **balacalaşmaq.**

**BALACALAŞDIRILMA** "Balacalaşdırılmaq"dan *f.is.*

**BALACALAŞDIRILMAQ** *məch*. Həcmcə, boyca, ölçücə balaca edilmək, kiçikləşdirilmək.

**BALACALAŞDIRMA** “Balacalaşdırmaq”-dan *f.is.*

**BALACALAŞDIRMAQ** *f.* Kiçikləşdirmək, kiçiltmək, balaca etmək, xırdalatmaq. *Həcmini balacalaşdırmaq.* // Daraltmaq.

**BALACALAŞMA** “Balacalaşmaq”dan *f.is.*

**BALACALAŞMAQ** *f.* Kiçilmək, xırdalanmaq, balaca olmaq. *Həcmi balacalaşmaq. O, azardan sonra lap balacalaşıbdır. – Xəlil onun irəliyə çıxmış qarnını ilk dəfə görürmüş kimi, diqqətlə baxdı: – Başın hər gün balacalaşır, qarnın böyüyür, ə, – dedi.* M.Hüseyn. // Gödəlmək, qısalmaq, yığılmaq. *Köynək yuyulmaqdan balacalaşıbdır. Palto islanıb balacalaşıbdır.*

**BALACALATMA** “Balacalatmaq”dan *f.is.*

**BALACALATMAQ** b a x **balacalaşdırmaq.**

**BALACALIQ** *is.* 1. Həcmcə, boyca, miqdarca, sayca kiçiklik, xırdalıq, azlıq; balaca şeyin halı.

2. Uşaqlıq, körpəlik. *Balacalığında çox nadinc idi. Balacalığına baxma, çox zirəkdir. – Yusif Qaraca qızın tərsliyinə təəccüb edib, arvadına deyərdi: – Bu zorbalıqda ayı mənim qamçımın qorxusundan hər cür oyun çıxarır, amma bu balacalıqda qızın əlində aciz qalmışam.* S.S.Axundov.

**BALACANLI** *sif.* Öz uşaqlarını həddən artıq sevən, uşaqcanlı. *Mən bu qədər balacanlı adam görməmişəm, – deyə Gümüş gəlin öz-özünə danışırdı.* S.Rəhimov.

**BALACIQ** “Bala”dan *oxş. Balacığım, harada idin? Əziz balacığım.*

**BALADADAŞ** *is. məh.* Təzə gəlinin kiçik qaynına verdiyi ləqəb.

**BALADƏMİR** *is. məh.* Xam gönü aşılamağa məxsus alət.

**BALAƏMİ** *is. məh.* Uşaqların kiçik əmilərinə verdikləri ad.

**BALAĞAGİRƏN** *is. köhn.* Fitilinə od vurduqda yerdə yana-yana fırlanan kiçik fişəng.

**BALAQ¹** *is.* Tumanın, şalvarın, dizliyin ayağa düşən tərəfi. *Səhər-səhər yaz çağı; Köçür oba yaylağa; Gəlinlərin balağı; Batır lilə, batlağa.* A.Səhhət. *Həsənalı balağı dizindən azca aşağı bez tumanını buduna sıxaraq bərk-bərk qışqırırdı.* M.İbrahimov.

**BALAQ²** *is.* Camış balası, körpə kəlçə. *..Mürşüd camış balaqlarını suvarmaq üçün çaya aparmışdı.* Ə.Vəliyev.

**BALAQ³** *is. məh.* Qamışabənzər, içi boş, buğumlu yemlik bitki.

**BALAQÁN** [əsli *fars.* “balaxanə” sözündən] Keçmişdə kütləvi teatr tamaşaları üçün açıq havada taxtadan düzəldilən müvəqqəti yüngül tikili. // Burada göstərilən ibtidai tamaşa. *Balaqan – səyyar küçə teatrına deyilir.* Ə.Bədəlbəyli.

**BALALAMA** “Balalamaq”dan *f.is.*

**BALALAMAQ** *f.* 1. Bala doğmaq. *İnək balaladı.*

2. *məc.* Artmaq, çoxalmaq, törəyib artmaq. *Milçəklər balalayıblar.*

**BALALÁYKA** *is.* [*rus.*] Üçsimli rus çalğı aləti. *Bu kəşf ayrı-ayrı xalqlarda, əvvəlləri sadə və getdikcə təkmilləşən saz, tar, tənbur, dombra, balalayka .. kimi müxtəlif növlü bir çox simli musiqi alətlərinin yaradılmasını təmin etdi.* Ə.Bədəlbəyli.

**BALALI** *sif.* Yanında balası olan. *Balalı inək. Balalı qoyun. Balalı camış.*

**BALALIQ** *is. anat.* Heyvanlarda rüşeymin inkişaf etdiyi daxili üzv.

**BALÁNS** [*fr.*] 1. Mühasibatda: aktiv və passiv hesabların qalıqlarını göstərən və hər hansı bir təsərrüfat və ya müəssisənin müəyyən dövr ərzindəki maliyyə vəziyyətini əks etdirən ümumi cədvəl; gəlir və çıxarın müvazinəti. *İllik balans.* – [Mirzə Salman:] [Camal] *bircə balansa qol çəksəydi.* S.Rəhimov.

2. *iqtis.* Mal idxalı ilə ixracı arasında nisbət. *Aktiv balans* (ixracın idxaldan artıq olması). *Passiv balans* (idxalın ixracdan artıq olması).

**BÁLAPUŞ** *is.* [*fars.*] *köhn.* Üstdən geyilən paltar. *Yarım nə gözəl geyinib, əlvan bəzənibdir; Balapuşu yaşıl.* M.P.Vaqif.

**BALATA, BALATI** *is. məh.* Maya, xəmrə, acıtma.

**BALBA** *is. məh.* Cincilim, keşniş, qazayağı və bu kimi bitkilərdən hazırlanan yemək, sıyıq.

**BALBAS** *is.* İri qoyun cinsi.

**BALBORANI** b a x **balqabaq.**

**BALÇI** b a x **arıçı.** *Balçının var bal tası, odunçunun baltası.* (Ata. sözü).

**BALDIR** *is.* Qılçanın dal tərəfində diz ilə topuq arasındakı ətli hissə. *Zabit badam şivini*

*əlinə alıb, qızın çılpaq baldırına döyür, qışqırırdı.* Mir Cəlal.

**BALDIRĞAN** *is. bot.* İriyarpaqlı uzunboy zəhərli bir bitki. [Qəmər və Şamo] *bir dəfə cır-cır bulağının kiçik şəlaləciyi altında baldırğandan dəyirman topu qayırıb işlətmiş(dilər).* S.Rəhimov.

**BALDIRĞANLIQ** *is.* Baldırğan bitən yer, baldırğan çox olan yer.

**BALDIRIAÇIQ** *sif.* və *zərf dan.* 1. Qıçları açıq, örtülməmiş, çılpaq; tumanı gödək. *O da başıaçıq, baldırıaçıq yığıb 24 uşağı cərgə ilə düzüb təlim verir.* C.Cabbarlı. [Qara kişi:] *Bu baldırıaçıq gəzməyi nə vaxtdan çıxartmısınız?* Ə.Əbülhəsən. // Lüt, səfil.

2. *məc.* Utanmaz, həyasız.

**BALDIRLAMA** "Baldırlamaq"dan *f.is.*

**BALDIRLAMAQ** *f. dan.* Baldırından yapışmaq, baldırından tutmaq, baldırına keçirmək. *İt onu qəfildən baldırladı.*

**BALDIZ** *is.* Arvadın və ya ərin bacısı. [Teymur ağa:] *Mən sənin baldızın Nisə xanıma təəşşüq yetirib, Allahın əmri ilə onu almağa talib idim.* M.F.Axundzadə. *Məsmənin həyatının üçüncü səhifəsi öz baldızının qəyyumluğundan çıxdığı tarixdən başlayır.* S.Hüseyn.

**BALDÖYƏN** *is. bot.* Şirin çiçəkləri olan şirəli bir ot.

**BALERÍNA** *is.* [*ital.*] Balet aktrisası, rəqqasəsi.

**BALÉT** *is.* [*ital.*] 1. Musiqinin müşayiəti ilə icra edilən rəqs və mimik hərəkətlərdən ibarət müəyyən teatr tamaşası. *Bu axşamkı baletə bilet aldıq. Balet məşqi.* // Bu cür tamaşa üçün yazılmış musiqi əsəri. *"Yeddi gözəl" baleti.*

2. Teatr rəqsi sənəti. *Klassik balet. "Koroğlu" operasının baleti.*

**BALETMÉYSTER** [*alm.*] 1. Balet rejissoru, baletə rəhbərlik edən adam. *XIX əsrin birinci yarısında rus baleti məşhur baletmeyster Didlonun parlaq yaradıcılıq fəaliyyəti sayəsində çox böyük müvəffəqiyyətlər əldə etmişdi.* Ə.Bədəlbəyli.

2. Rəqs müəllimi.

**BALƏNG** *is.* 1. Zirə otuna oxşayan qara toxumlu dağ otu.

2. Portağala, limona bənzər, lakin onlardan böyük olan turş acı dadlı ətirli bir meyvə.

**BALGÜLÜ** *is. bot.* Şirin çiçəkləri olan sarmaşıq bitki.

**BALIQ¹** *is.* 1. Qəlsəmə ilə tənəffüs edən, temperaturu dəyişən, üzgəclə hərəkət edən su heyvanı. *Siyənək balığı. Balıq əti. Balıq yağı. Balıq tutmaq. Balıq şorbası. Balıq toru. – Balığı haçan tutsan təzədir.* (Ata. sözü).

◊ **Dəryada balıq sövdası** – gerçək olmayan danışıq, ortalıqda olmayan qeyri-real söhbətlər.

**BALIQ²** *is. məh.* Oturaq kənd, qəsəbə; abad tikili qrupu.

**BALIQBELİ** *sif. məh.* Ortası balıq beli kimi dik (ev üstü, yonulmuş ağac və s.). *Alaqapıdan girdikdə, ortadan balıqbeli, geniş bir yol salınmışdır.* S.Rəhman.

**BALIQCIL** *is. zool.* Leylək kimi uzun qıçlı, uzun dimdikli, kiçik balıqlarla qidalanan ala-bəzək quş.

**BALIQÇI** *is.* 1. Balıq ovlayan, balıq tutmaqla məşğul olan adam. *Balıqçı qayığı. Balıqçı toru. – Balıqçılar qayıqla çıxıb yenə Xəzərə.* M.Seyidzadə.

2. Balıq satan. *Balıqçı dükanı.*

**BALIQÇILIQ** *is.* Balıq tutma sənəti, balıqçı sənəti; balıq tutmaqla məşğul olma. *Balıqçılıqla məşğul olmaq.*

**BALIQƏTİ** *is. anat.* Baldırın dal səthində olan qalın əzələ kütləsi.

**BALIQİÇİ** *is. aşp.* Bişirilən balığın qarnına doldurulan qoz, soğan və kişmişdən ibarət iç.

**BALIQQULAĞI** *is.* Müxtəlif onurğasız heyvanların üz tərəfi, adətən buynuz təbəqədən, iç tərəfi isə sədəf təbəqədən ibarət olan örtü hissəsi, qabığı. *Sahildə balıqqulağı topladıq. Balıqqulağından hazırlanmış bəzək şeyləri. – Sarayın darvazası qarşısında .. gözmuncuqları və balıqqulaqları ilə bəzənmiş boynu zınqırovlu dəvələr durmuşdu.* Çəmənzəminli. // Tərkibi balıqqulaqlarından ibarət olan daş. *Əlvan balıqqulağı gözəl tikinti malıdır.* Mir Cəlal. [Hümmət] *taxta parçalarından düzələn köhnə komanı sökərək, onun yerinə balıqqulağı daşlardan .. bir ev tikib düzəltmişdi.* S.Rəhimov.

**BALIQLI** *sif.* 1. İçərisində balıq olan. *Balıqlı göl. Balıqlı çay. Balıqlı sular.*

2. Balıqdan hazırlanmış (yemək).

**BALIQTUTAN** b a x **balıqçı** 1-ci mənada.

**BALIQUDAN** *is. zool.* bax **qutan.**

**BALIQYETİŞDİRMƏ** *is. zool.* Vətəgə balıqlarının süni şəraitdə çoxaldılması.

**BALINC** bax **balış.** *Bahadır başını balıncdan qaldırdı.* N.Nərimanov. [Sadıq kişi] *köynəkcək qalxdı, balıncı aparıb yavaşca Vahidin başı altına qoydu.* Mir Cəlal.

**BALINCÜZÜ** bax **balışüzü.** *Vaqon xidmətçiləri sərnişinlərə işlənmiş əl-üz dəsmalı, döşəkağı, balıncüzü verdiklərindən, sərnişinlər arasında qiyamət qopmuşdu.* "Kirpi".

**BALIŞ** *is.* 1. Quş tükü və ya başqa yumşaq, mütəhərrik şeylər doldurulmuş yataq ləvazimatı, yastıq. *Pəncərədən içəri girən ruzgar da onun balışı üzərində tökülən saçlarını dalğalandırır.* M.S.Ordubadi. [Rüstəm:] *Atam altına balaca döşəkcə salmış, bardaş quraraq arxasını balışa söykəmişdi.* M.İbrahimov.

2. *məh. xüs.* Çardaq taxtalarından hər biri.

**BALIŞAĞI** bax **balışüzü.**

**BALIŞÜZÜ** *is.* Yastığa keçirilən üz. *Kətan balışüzü. Balışüzü düyməsi.*

**BALÍNA** [*fr.*] Bədəncə balığa oxşar çox iri dəniz məməlisi; kit. *Balina ovu. Balina sümüyü. Balina bütün məməli heyvanlar kimi istiqanlı heyvandır.*

**BALKAR** *is.* Şimali Qafqazda yaşayan türkdilli xalq və bu xalqa mənsub adam.

**BALKARCA** *sif.* və *zərf* Balkar dilində.

**BALKÓN** [*ital.*] 1. Evlərin, binaların qabaq tərəfində tikilən artırma, üstü açıq, ya örtülü məhəccərli meydança. *Açıq balkon. Balkon pəncərələri. – Balkonda bir qarışa qədər qar vardı.* S.Hüseyn. *Qoca usta .. daş pilləkənlə qalxıb, şüşəbəndli balkona çatdı.* M.Hüseyn. *Ev sahibi balkonda stol qoyub, çay süfrəsi saldı.* Mir Cəlal.

2. Teatrda: üst yaruslarda olan yerlər.

**BALKONLU** *sif.* Balkonu, ya balkonları olan. *Balkonlu ev.*

**BALQABAĞI** *sif.* Balqabaq kimi, balqabaq şəklində. *Balqabağı qarpız.*

**BALQABAQ** *is.* 1. Uzunsov, ortası nazik şirin qabaq, boranı, kudu. *Kənd arvadları qışın tədarükünü qurtarırdı, .. kimisi yaman günün köməyi olan kudu və balqabaqları gizlədirdi.* M.İbrahimov. // *məc.* Balqabağa oxşayan şey haqqında. *Bu halda gördüm, mənə tərəf bir kişi gəlir .. başı balqabaq...* Ə.Haqverdiyev.

2. *məc. dan.* Key, maymaq, ruhsuz, atil, bacarıqsız, iradəsiz, küt adam haqqında. [Əlyarov:] *Xəlil nadir ki, o məni işdən çıxardır, bunlar da balqabaq kimi durub baxırlar.* M.Hüseyn.

**BALLÁDA** [*fr.*] *ədəb.* 1. Əfsanə, nağıl, yaxud tarixi məzmunda yazılmış təhkiyə üslubunda mənzum əsər.

2. *mus.* Əsasən rəvayət mahiyyətində olan oxunulan, ya çalınan musiqi əsəri növü. *Keçmiş bir hadisəni kiçik bir hekayə şəklində nəql edən musiqi əsərlərinə "ballada" deyilir.* Ə.Bədəlbəyli.

**BALLÁST** [*ing.*] Üzərində dəmiryol şpalları duran dəmiryol yatağının üzərinə döşənən çınqıl, qum və s.

**BALLI** *sif.* 1. Bal qatılmış. *Ballı konfet.*

2. *məc.* Bal kimi şirin. *Bir alagözlünü sevibdi könül; Dəhani püstədir, dodağı ballı.* Aşıq Bəndə.

**BALLIBADI** *is.* Bal qatılmış qoğal, şirin çörək.

**BALLICA** bax **qırmızıbaldır.**

**BALLİSTÍK** *sif.* Ballistikaya aid olan. *Ballistik raket.*

**BALLÍSTİKA** [*yun.*] 1. Nəzəri mexanikanın fəzaya atılmış ağır cismin hərəkət qanunlarını öyrənən şöbəsi.

2. Mərminin, silahın lüləsi içərisində və bu lülədən çıxdıqdan sonrakı hərəkət qanunlarını tədqiq edən elm.

**BAL-MASKARÁD** [*fr.*] İştirakçıları üzlərinə maska taxmış və fantastik paltarlar geymiş halda gəldikləri şənlik və rəqs məclisi.

**BALNEOLÓGİYA** [*xar.*] Təbabətin, mədən suları və palçıqların kimyəvi tərkibini, habelə bunların müalicə təsiri və üsullarını öyrənən elm.

**BALNEOLOJÍ** *sif.* Balneologiyaya aid olan. *Balneoloji kurort.*

**BALNEÓLOQ** [*xar.*] Balneologiya mütəxəssisi.

**BALÓN** [*fr.*] 1. Maye və qaz saxlamaq üçün dəmir və ya plastik materialdan hazırlanmış qab.

2. İçərisinə hava doldurulmuş rezin şin.

3. Aerostatın, içinə qaz doldurulan qovuğu. // İçərisinə doldurulmuş havadan yüngül qazın köməyi ilə havaya qalxıb, orada dura bilən şar, uçucu aparat.

**BALSÜZƏN** *is. xüs*. Arı şanından balı çıxarmaq üçün cihaz.

**BALTA** *is*. Odun doğramaq, ağac kəsmək və s. üçün işlədilən saplı, enli və itiağızlı dəmir alət. *Balta ilə odun doğramaq. Odun baltası. Balta ilə kəsmək. – Balta ağac kəsməzdi, sapı ağac olmasaydı*. (Ata. sözü). // *tex*. Neft quyularının qazılmasında işlədilən qazıcı alət. *Vışkanın təpəsindən bucurqada sarınan kanatı* (*burazı*) *keçirmək üçün bir blok asılır və bunun vasitəsilə açıq və ya dəmir ştanqlara bağlanmış balta quyuya endirilib qaldırılırdı*. Quliyev. *Baltaları işləyir yerin dərin qatına*. M.Seyidzadə.

◊ **Balta görməmiş** – əl dəyməmiş, əl vurulmamış, təbii halında qalmış. *Balta görməmiş meşə.* **Balta ilə yonulmamış** – kobud, qaba, tərbiyəsiz, qanmaz adam haqqında. **Balta vurmaq** *məc.* – bax **baltalamaq** 3-cü mənada. [İbrahim bəy:] *Sən də, əlbəttə, gərək onu pisləyəsən, çünki balta vuranların birisi sizin cənabınız oldu.* N.Vəzirov. **Baltanı daşa vurmaq** – işi baş tutmamaq, müvəffəqiyyətsizliyə uğramaq, işi nəhs gətirmək. **Baltanı dibindən vurmaq** – bir şeyə qarşı etiraz etmə, danışmağa, fikir söyləməyə yer qoymamaq, susdurmaq, qəti hərəkət etmək. [İttifaq üzvü:] *A yoldaş təhkimçi, siz lap baltanı dibindən vurursunuz*. Mir Cəlal. **Baltası kəsməmək** *məc.* – sözü keçməmək, nüfuzdan, etibardan düşmək. **Buz baltası** bax **buz.**

**BALTABİC** *is. məh.* Çökə ağacının çiçəyi.

**BALTAÇI** *is.* 1. Ağac kəsən, odun doğrayan. *Baltaçılar meşəyə getdilər.*

2. Balta qayıran usta.

**BALTAÇILIQ** *is*. Balta ilə ağac kəsmək və ya odun doğramaq sənəti.

**BALTADİMDİK** *is. zool.* Çox yoğun dimdiyi olan bir quş.

**BALTADİŞ** *sif. dan.* Yekə və bərk dişli.

**BALTAGÖRMƏZ** *sif.* Sıx, keçilməz. *Baltagörməz meşə.*

**BALTAKƏSMƏZ** *sif.* 1. Çox bərk, çox möhkəm, çox qalın.

2. *məc.* Kobud, gönüqalın.

**BALTAQIRAN** *is. məh.* bax **baldırğan.**

**BALTALAMA** "Baltalamaq"dan *f.is.*

**BALTALAMAQ** *f.* 1. Balta ilə çapmaq, kəsmək, yarmaq, doğramaq; balta ilə vurmaq. *Onları karvan əhli baltaladı; .. Doğrayıb, yandırıb ocaq qaladı*. A.Səhhət.

2. *məc.* Yıxmaq, devirmək, dağıtmaq, məhv etmək, kökünü kəsmək, ortadan qaldırmaq; sarsıtmaq. *Nadanlığa qarşı mübarizə! Cəhalət və mövhumatın kökünü baltalamaq, xalq kütlələrinin gözünü açmaq, .. azadlıq və səadətin yollarını ona göstərmək! Nərimanovun ilk əsəri olan "Nadanlıq"ın tarixi mənası budur.* M.İbrahimov.

3. *məc*. Birinin əleyhinə iş görmək, ziddinə danışmaq; birinə quyu qazımaq.

◊ **Dibindən baltalamaq** – bir sözü, ya danışığı dibindən, biryolluq kəsmək, danışmaq üçün yer qoymamaq.

**BALTALANMA** "Baltalanmaq"dan *f.is.*

**BALTALANMAQ** *məch*. Balta ilə kəsilmək (çapılmaq, yarılmaq, doğranmaq).

**BALTALATMA** "Baltalatmaq"dan *f.is.*

**BALTALATMAQ** *icb*. Balta ilə kəsdirmək, çapdırmaq, doğratmaq.

**BALTALI** *sif.* Əlində balta olan, balta ilə işləyən. *Ağac yıxılanda əli baltalı da yeriyər, əli baltasız da*. (Ata. sözü).

**BALZÁM** [*yun.*] Balzam ağacından hasil edilən və tərkibində efir yağları olan yarıduru ətirli qatran.

**BALZAMLAMA** "Balzamlamaq"dan *f.is.*

**BALZAMLAMAQ** *f.* Çürüməmək üçün (meyitə) xüsusi maddələr hopdurmaq; mumiyalamaq.

**BALZAMLANMA** "Balzamlanmaq"dan *f.is.*

**BALZAMLANMAQ** *məch*. Hopdurulmaq, mumiyalanmaq.

**BAMAZI** bax **pamazı.**

**BAMBALACA** *sif.* Lap balaca. *Güllü bambalaca gen tumanda, qolu çirməkli olduğu halda, oğlu ilə qabaq-qarşı durub danışırdı.* Ə.Əbülhəsən.

**BAMBAŞQA** *sif.* Tamamilə başqa, tamamilə ayrı. *Bambaşqa məsələ. Bambaşqa iş. Gözlərimin önündə bambaşqa bir aləm açıldı. Onun xasiyyəti bambaşqadır.* – [Nadir] ..

*Məryəmin artıq uzanmış saçlarını Zeynəbin saçları ilə müqayisə edəndə, yenə də – yox, .. o bambaşqadır* [deyə düşündü]. B.Talıblı.

**BAMBILI** *sif. dan.* Ləyaqətsiz, vecsiz, qeyri-ciddi, boş, yüngül, gülünc, avara, lüt. [Şeyx Nəsrulla:] *Həmin bu mərəzin bərəkətindəndir ki, mən bu bambılı Əhmədin yanında olmuşam bir balaca uşaq...* C.Məmmədquluzadə. [Əbdürrəhman bəy:] *Mən niyə dəli oluram, dəli sənin kimi olur ki, belə bambılı dərviş başına ip salıb dəli kimi oynadır.* N.Vəzirov. // *is.* Qeyri-ciddi, dəyərsiz, ləyaqətsiz adam, avara. *A kişi, gənə bu bambılılar bilmirəm xalqdan nə istəyirlər?* C.Məmmədquluzadə. *Mahalın beş-on bambılısı yığılıb bir yerə, nədi-nədi biz Vinokurov kimi nəhəngi yıxacağıq*. Ə.Haqverdiyev.

**BAMBÚK** [*malay.*] *bot.* 1. İsti ölkələrdə bitən içi boş, çox bərk, yüngül, yoğun, qamışabənzər bitki (ağac). *Bambuq meşəsi.* – *Aşağılarda kokos palmaları, banan və bambuk ağacları bir-birinə qarışaraq qolbudaq atmışdır*. M.İbrahimov.

2. Bu ağacdan qayrılmış. *Bambuk koma. Bambuk mebel.*

**BAMƏZƏ** *sif.* [*fars.*] 1. Məzəli, dadlı.

2. Zarafatçı, lətifəçi, məzəli. *O çox baməzə qoca idi, zarafat etməyi və lətifə söyləməyi çox sevirdi.* M.S.Ordubadi. *Onun adı* [Xəlil] *idi, özü də baməzə oğlanlardan biri idi*. "Kirpi".

**BAMİYƏ** *is.* [*fars.*] 1. *bot.* Meyvəsi konus şəklində olan və xörəyə işlədilən birillik lifli bitki.

2. Bu bitkinin meyvəsi.

3. Un, yağ, şəkər və s.-dən hazırlanan bamiyə şəklində şirni.

**BAN¹** *is*. 1. Arabanın təkərlərindən yuxarı olan hissəsi, qutusu, gövdəsi. *Araba banı.* – *Araba cırıldamaqdan, ban cırıldayır.* (Ata. sözü). // Eyni mənada avtomobildə.

2. Heyvanı qoşmaq üçün, arabanın qabağında olan ağac; yan dişlə.

3. Evin damı ilə tavanı arasında olan hissə.

4. Tüstü çıxmaq, təmiz hava gəlmək və işıq düşmək üçün keçmişdə kənd evlərinin damında açılan baca, dəlik.

**BAN²** *is.* Xoruz səsi, xoruz banlaması. *Səhər tezdən ban səsinə ayıldım.* – *Eşidilən bir səs varsa, o da xoruz banları və köpəklərin səsi idi.* M.S.Ordubadi. [Xəlil:] *Xoruzların üçüncü banınadək söhbət elədik.* Ə.Haqverdiyev. *Xoruz banı... Dan ulduzu... Şəfəqli ürək; Vüqar ilə mən anıram ötən gəncliyi.* S.Vurğun.

**BAN³** *is*. [*ər.*] 1. Misir söyüd ağacı.

2. *məc.* Ucaboylu, qamətli; biçimli.

**BANÁN** [*isp.*] *bot.* 1. Meyvə və ya lif üçün yetişdirilən, çox iri yarpaqları olan uca tropik ağac. *Banan ağacı.*

2. Bu ağacın qalın və sarı qabıqlı uzunsov meyvəsi.

**BANBAL** *is. məh.* İri barama.

**BÁNDA** *is.* [*ital.*] Cinayətkarlar, qatillər güruhu, dəstəsi. *Təbriz xalqına .. asayiş və əmniyyət gətirən dinc soldatlara hücum edən şərarətçilər bandalar kimi təsvir edilirdi.* M.S.Ordubadi. [Dəmirov:] *Zülmət dəstəsi* [qolçomaq] *qalıqlarından düzəlmiş olsa belə, xarici düşməndən ruh alan bir bandadır!* S.Rəhimov.

**BANDÁJ** [*fr.*] 1. Qarnın divarlarını normal vəziyyətdə saxlamaq üçün elastik kəmər, bağ. *İdmanda zədələnmə hallarının qarşısını almaq üçün ən yaxşı qoruyucu vasitələr: sipərlərdən, maskalardan, bandajdan istifadə edilməsindən, oynaqların bintlənməsindən ibarətdir.* Babayev.

2. *tex.* Vaqon, yaxud parovoz təkərlərinin üzərində qoruyucu polad çənbər. *Uşaqlar qatarın yanınca gedərək əllərindəki uzundəstəli çəkiclə çarxları vurur və səslərinə diqqətlə qulaq asırdılar; kəskin cingiltili səs çarxda bandajın olmadığını göstərir.* (Qəzetlərdən).

**BANDAJÇI** *is.* 1. Bandaj (1-ci mənada) qayıran usta.

2. *tex.* Təkərlərə bandaj (2-ci mənada) keçirən usta.

**BANDAQ** *is.* Saxlanmaq üçün saplağından dəstə ilə uzun ipə bağlanmış meyvələr və bu meyvələrin bağlandığı ip. *Süfrədə bandaqlardan yenicə kəsilmiş, çöpü qurumuş Gəncə üzümü, .. üçbucaq salfetlər də vardı*. Mir Cəlal.

**BANDAQLAMA** "Bandaqlamaq"dan *f.is.*

**BANDAQLAMAQ** *f.* Bandaq bağlamaq; qışa saxlamaq üçün meyvəni saplağından

dəstə ilə uzun ipə bağlamaq. *Qış üçün üzüm bandaqlamaq*.

**BANDAQLANMA** "Bandaqlanmaq"dan *f.is.*

**BANDAQLANMAQ** *məch.* Bandaq bağlanmaq, qışa saxlanmaq üçün saplağından uzun ipə bağlanmaq.

**BANDAQLANMIŞ** *f.sif.* Bandağa bağlanmış, qışa saxlanmaq üçün saplağından uzun ipə bağlanmış. *Bandaqlanmış üzüm.*

**BANDAQLATMA** "Bandaqlatmaq"dan *f.is.*

**BANDAQLATMAQ** *icb.* Bandaq bağlatmaq, bandaq vurdurmaq. *Bu il çoxlu üzüm bandaqlatmışıq.*

**BANDAQLIQ** *sif.* Bandaq bağlamağa (qışa saxlamağa) yarar. *Bandaqlıq üzüm.*

**BANDERÓL** *is.* [*fr.*] 1. Poçt ilə göndərilən şeylərin büküldüyü enli kağız sargı.

2. Poçt ilə bu cür sarğıda göndərilən hər hansı bir şey.

3. Aksiz və ya gömrük rüsumunun verildiyini bildirmək üçün malın üstünə yapışdırılan yarlıq.

**BANDEROLLAMA** "Banderollamaq"dan *f.is.*

**BANDEROLLAMAQ** *f.* Üzərinə banderol çəkmək (vurmaq).

**BANDEROLLANMA** "Banderollanmaq"-dan *f.is.*

**BANDEROLLANMAQ** *məch.* Üzərinə banderol çəkilmək (vurulmaq).

**BANDEROLLU** *sif.* Üzərinə banderol yapışdırılmış, üzərinə banderol çəkilmiş. *Banderollu tütün. Banderollu qutu. Banderollu çay.*

**BANDEROLSUZ** *sif.* Banderolu olmayan, üzərinə banderol yapışdırılmamış. *Banderolsuz tütün.*

**BANDİ́T** [*ital.*] Soyğunçu, quldur, qarətkar, talançı. *Bandit dəstəsi. – Banditlər səksəkəli halda yerlərindən sıçraşdılar*. M.Hüseyn. *Cümə günü bütün banditlər öz dəstələri ilə ayı çınqılına toplandılar.* Ə.Vəliyev.

**BANDİTCƏSİNƏ** *zərf* Bandit kimi, quldur kimi, quldurcasına.

**BANDİTİ́ZM** [*ital.*] Quldurluq, soyğunçuluq, zorakılıq, adam öldürmək, təxribatçılıq və s. məqsədi ilə silahlı quldur dəstələri yaratmaqdan, bu dəstələrdə və onların düzəltdiyi basqınlarda iştirak etməkdən ibarət cinayət işi. *Banditizm ilə mübarizə.*

**BANDÚR(A)** [əsli *yun.*] Barmaqla çalınan çoxsimli, geniş qollu Ukrayna musiqi aləti. *Bu kəşfiyyat ayrı-ayrı xalqlarda əvvəlləri sadə və getdikcə təkmilləşən qusli, bandura, mandalina .. kimi müxtəlif növlü bir çox simli alətlərin yaradılmasını təmin etdi.* Ə.Bədəlbəyli. *De, kimin yurdudur sünbüllü çöllər? Kimindir banduru söylədən ellər?* S.Vurğun.

**BANDURÇALAN, BANDURÇU** *is.* Bandur adlı musiqi aləti çalan çalğıçı.

**BANİ** *is.* [*ər.*] 1. Bir şeyin əsasını, bünövrəsini qoyan, təsis edən, bina edən, tikən, quran, yaradan. *Üzeyir Hacıbəyov Azərbaycan opera sənətinin banisi olmuşdur.*

2. Təşəbbüsçü, səbəbkar. *Bu ədavətdə bani hansı idi və müqəssir hansı idi?* C.Məmmədquluzadə. *Sabir ilə belə məktubu çox aldıq səndən; Hər nə yazdıqsa ona, bani sən oldun, qardaş!* A.Səhhət.

**BANK** [*fr.*] 1. Pul vəsaitini toplayan və təqsim edən kredit idarəsi. *Dövlət bankı. Kommunal bank. Kənd təsərrüfatı bankı.*

2. Borc kapitalını bir araya toplayan xüsusi kredit idarəsi.

3. *dan.* Qumarda: kağız paylayanın ortaya qoyduğu pul. ☐ **Banka getmək** – bankda (ortada) olan bütün məbləğə oynamaq.

**BANKÁ¹** *is.* [*pol.*] 1. Silindrşəkilli şüşə və ya saxsı qab. *Qəfəslərə yığılmış şüşə bankalardakı saçaqlı konfetləri .. siçanlar darmadağın etmiş*(*di*). H.Sarabski. *Bankanın ağzı açılanda ətir qoxusu evi başına götürdü*. Ə.Haqverdiyev.

2. Konservləşdirilmiş məmulat üçün dairəvi tənəkə qab (ət, balıq konservlərinin qabı).

3. *is. tib*. Xəstələrin kürəyinə qoyulan armudşəkilli şüşə qab. *Bankalardan sonra dalım bərk ağrıyır. – ..İndi sizə bir balaca da soyuqdəymənin qabağını almaq üçün banka qoymaq lazımdır*. S.Rəhimov.

**BANKA²** *is.* [*holl.*] Qayıqda avarçəkənlər üçün qoyulmuş oturacaq.

**BANKÉT** [*fr.*] İctimai, siyasi xadimlərin və s.-nin şərəfinə düzəldilən təntənəli qonaqlıq, ziyafət.

**BANKƏ** *is.* [*holl.*] Dənizin dayaz yerlərindən ibarət olan sahə. *Xəzər dənizində Kür bankəsi.*

**BANKÍR** [*fr.*] Kapitalist ölkələrində; bank sahibi və ya səhmdarı; kapitalist.

**BANKNÓT** [*ing.*] *mal.* Dövlət bankı tərəfindən buraxılan və tədavüldə pul kimi işlənilən biletlər. // Emissiya bankları tərəfindən buraxılan kredit pulları.

**BANKRÓT** [*fr.*] Müflis, iflas etmiş. *Şəhərdə bərk səs var ki, Hacı Saleh bankrotdu.* S.S.Axundov. □ **Bankrot etmək (çıxarmaq)** – iflasa uğratmaq, var-yoxdan çıxmasına səbəb olmaq.

**BANKROTLUQ** *is.* Müflislik.

**BANLAMA** "Banlamaq"dan *f.is.*

**BANLAMAQ** *f.* 1. Oxumaq, ötmək (xoruz, beçə, qırqovul haqqında). *Xoruz banlayır. – Bir qarının bir xoruzu var idi; Hər gün obaşdandan o banlar idi.* A.Səhhət. *Haradasa, xarabalıqda doğrudan da bir xoruz banlayırdı.* Ə.Məmmədxanlı.

2. *məc.* Qışqırmaq, bağırmaq. *Bir də görürsən ki, olub heyvərə; Əlli uşaq banladı birdən-birə.* M.Ə.Sabir. *Odur ki, hürriyyətinisvan deyə, şəst ilə banladım.* C.Cabbarlı. // *dan.* Birdən yerindən danışmaq, qışqırmaq. *Nə banlayırsan oradan.*

**BANLAŞMA** "Banlaşmaq"dan *f.is.*

**BANLAŞMAQ** *qarş.* Hamı birdən səs-səsə verib banlamaq, ağız-ağıza verib qışqırmaq, hamı birdən bağırmaq. *Xoruzlar banlaşdılar. Qırqovullar çöldə banlaşır. – Xoruzlar banlaşan zaman girdik kəndə.* Ə.Haqverdiyev. *Ətrafda xoruzlar banlaşır.* Çəmənzəminli. *Bütün həyətlərdə kəndin xoruzları banlaşırdı.* Ə.Məmmədxanlı.

**BANT** [*alm.*] Bəzək kimi işlədilən ortadan qəşəng düyünlənmiş lent. *Bant bağlamaq. Saçına bant bağlanmış qız.*

**BANTLI** *sif.* Bant bağlamış (bağlanmış). *Başı bantlı balaca qız hörükləri döşündən aşağı sallanmış anasının boynuna sarınmışdı.* S.Rəhimov.

**BANU** *is.* [*fars.*] *köhn.* Xanım. *Açıldı başın, indi qıl öz dərdivə çarə; Banu hərəm oldun.* M.Ə.Sabir. [Qızıl Arslan] *"Çahar dərviş" romanını yoxladığı zaman Rövşən "Banu" hekayəsini oxuyurdu.* M.S.Ordubadi.

**BAPTÍST** [*yun.*] Baptizm təriqətinə mənsub adam.

**BAPTÍZM** [*yun.*] Xristian təriqətlərindən birinin adı.

**BAR[1]** *is.* [*fars.*] Meyvə, məhsul. Bar almaq. *Bar götürmək. Bar bağlamaq. Bar tutmaq. Bar vermək. – Ağac bar verdikcə başını aşağı dikər.* (Ata. sözü). *Bar verən ağacı kəsməzlər.* (Ata. sözü). [Mirzə Fətəli:] *İllər keçib, zamanələr dolanıb, o şəxslərin əkdikləri toxumlar bar verib..* Ə.Haqverdiyev. *Ağac bar gətirmək üçün əkilir.* C.Cabbarlı. *Bel götürüb su verdikcə torpağa; Hər ağacdan nemət alır, bar alır.* S.Vurğun. // *məc.* Səmərə, xeyir, mənfəət, fayda. *..İndi bu dostluq cəbhə şəraitində də bar verməli idi.* Ə.Əbülhəsən.

**BAR[2]** *is.* [*fars.*] *klas.* Yük, ağırlıq. Bar daşımaq. // Məc. mənada. *Kim dözər mənim tək belə firqətə; Rəncü məşəqqətə, barimöhnətə.* M.P.Vaqif. *Qəmü möhnət bu gün yoxdur cahanda çəkməyən, amma; Şikəstə Zakirin çərxi-fələk barın giran tutmuş.* Q.Zakir.

**BAR[3]** *is. məh.* 1. Kif, boyat çörək və xörəklərdə əmələ gələn ağ rəngli göbələkciklər.

2. Ərp, pas, kir (xəstənin dil-dodağında).

**BAR[4]** [*ing.*] Ayaq üstə duraraq yemək yeyilən, ya içki içilən kiçik yeməkxana, qəlyanaltıxana. *Pivə barı.*

**BAR[5]** *is.* [*ing.*] Qazıma maşınının və mədən kombaynının işlək hissəsi.

**BAR[6]** *is.* [*yun.*] 1. Səs təzyiqi vahidi.

2. Atmosfer təzyiqi vahidi.

**BAR[7]** *is.* [*fars.*] *köhn.* Ocaq, od.

**BAR[8]** *is.* Prob, əyar (qiymətli metallarda).

**BAR[9]** *is.* [*fars.*] *köhn.* Peyin, təzək.

**BAR[10]** *is.* [*fars.*] *köhn.* Yüksək mənsəb sahibləri üçün düzəldilən rəsmi qəbul.

**BAR[11]** *is.* [*ing.*] Servantın müxtəlif içki şüşələri üçün ayrılmış xüsusi bölməsi.

**BARABÁN** [*rus.*] 1. İki üzünə dəri çəkilmiş, içiboş, enli, silindrşəkilli, ağacla vurularaq çalınan çalğı aləti; təbil, nağara. *Axşam-*

*üstü Tərlan yenə baraban səsi eşidib yola sarı baxdı..* M.Hüseyn.

2. *tex.* Müxtəlif maşınlarda və mexanizmlərdə: içiboş silindr şəklində detal.

**BARABANÇI** *is.* Baraban çalan, nağara çalan.

**BARÁK** [*fr.*] 1. Taxtadan tikilən müvəqqəti, yüngül yaşayış binası. *Smirnov, qəsəbənin ən böyük fəhlə baraklarından birində ayaq üstündə durub, dostlarına Bakı komitəsinin müraciətini oxuyurdu.* M.Hüseyn.

2. Yoluxucu xəstələrə məxsus ayrıca xəstəxana binası.

**BARAMA** *is.* 1. İpəkqurdu tırtılının nazik ipək liflərindən hörərək, içində oturduğu qapalı yuvacıq, qutu, qoza. *Sona xala deyirdi: ..Biz indiyə kimi barama içində dustaq yatan ipək qurduna bənzəyirdik.* S.S.Axundov. ☐ **Barama toxumu** – ipəkqurdu kəpənəyinin yumurtası.

2. *məh.* Dişin dibində əmələ gələn şiş.

**BARAMAÇI** *is.* 1. Barama saxlamaq və becərməklə məşğul olan şəxs; kümçü.

2. *köhn.* Barama alverçisi.

**BARAMAÇILIQ** *is.* Barama becərmə sənəti; barama yetişdirməklə məşğul olma; kümçülük. *Baramaçılıq təsərrüfatı.*

**BARAMAQURDU** *is.* İfraz etdiyi ipək tellərindən barama hörən qurd.

**BARAMALAMA** "Baramalamaq"dan *f.is.*

**BARAMALAMAQ** *f.* 1. Barama sarımaq, qoza bağlamaq.

2. *məh.* Diş ətində şiş əmələ gəlmək.

**BÁRAN** *is.* [*fars.*] *klas.* Yağış, yağmur. *Sanma barandır yağan matəmgəhi-ünsiyyətə; Halımız təsiri-bəxşi-qəm olub qüdsiyyətə.* M.Hadi.

**BARAT** *is.* [*ər.*] 1. Bank və s. maliyyə müəssisəsi və ya poçt vasitəsilə göndərilən pul. *Bütün məktublar və ya baratlar dərhal sahiblərinə paylanır.* – [Səttar] *baratı dəyişmək üçün yaxındakı sərraf dükanlarından birinə tərəf getdi.* P.Makulu. ☐ **Barat etmək (çəkmək, göndərmək)** – pulu bir adam və ya idarə vasitəsilə başqa yerə, yaxud başqa bir ölkəyə göndərmək. *..Birisi axşam yeməyi üçün tədarük görməyibdir, birisi poçt ilə gərək pul barat eləsin.* Ə.Haqverdiyev. [Kazım:] *Pulları haman yerə barat verəcəyəm.* M.S.Ordubadi.

2. Qəbz, vəsiqə, təhvil sənədi.

**BARATA** *is. məh.* Yer səthini örtmüş palçıq layı.

**BARBAR** [əsli *yun.*] Vəhşi, kobud. *Faşist barbarları.*

**BARBARİZM** [*yun.*] b a x **barbarlıq.**

**BARBARLIQ** *is.* Vəhşilik, mədəniyyətsizlik, qabalıq. *..Avropa alim və filosofları fəryad edirlər ki, biz barbarlıq, vəhşilik və cəhalət aləmindən çıxaq..* M.F.Axundzadə. [Dilbər:] *..Rica edirəm, sözlərinizə diqqət edin, yüksək cəmiyyətdə belə rəftar barbarlıqdır.* C.Cabbarlı.

**BARDAQ** *is.* Su və ya başqa mayelər tökmək, yaxud içində piti bişirmək üçün saxsıdan, çinidən və s.-dən qayrılmış qulplu və ya qulpsuz darboğaz qab; səhəng, cürdək. *Bir tərəfdə tayanın dibində su bardağı, çörək düyünçəsi, əyin paltarı və bir neçə boş çuval* [durmuşdur]. C.Məmmədquluzadə. *Gülnaz saxsı bardaqdakı qatıqdan mis kasaya töküb, ucu yeyilmiş taxta qaşıqla çalxalamağa başladı.* M.İbrahimov. *Adama belə gəlirdi ki, bu qız su ilə dolu bir bardağı başında aparsa, bardaq yırğalanmaz..* Ə.Sadıq.

**BARDAN** *is.* İçərisinə pambıq, barama, yun və s. qoymaq üçün böyük kisə; xaral. *Pambığı bardanlara doldurmaq.* – *Dərilib basılır xaşa bardana; Vaqona vurulur, gedir hər yana.* Aşıq Şair Vəli.

**BARDANLAMA** "Bardanlamaq"dan *f. is.*

**BARDANLAMAQ** *f.* Bardana doldurmaq.

**BARDANLANMA** "Bardanlanmaq"dan *f.is.*

**BARDANLANMAQ** *məch.* Bardana doldurulmaq.

**BARDANLIQ** *sif.* Bardana yarayan.

**BARDAŞ: bardaş qurmaq, bardaş qurub oturmaq** – dizlərini qatlayıb baldırlarını bir-birinə keçirərək oturmaq. *Otaqda tək qalan xan bir neçə dəfə qalxıb oturdu, bardaş qurdu, rahat olmayıb dizi üstə əyləşdi.* Çəmənzəminli. *Şamil, Əhməd kişinin daxmasına girəndə bardaş qurub oturmuş ev yiyəsi onu gülər üzlə qarşıladı.* M.Hüseyn. *Bizdən sonra hamı bir-bir bardaş qurub oturdu.* S.Rüstəm.

**BAREL** *is.* [*ing.*] Maye, səpələnən və s. malların ölçü vahidi (təxminən 159 litr).

**BARELYÉF** [*fr.*] bax **qabartma** 3-cü mənada.

**BARƏ**[1] [*fars.*] Adətən nisbət şəkilçiləri ilə işlənir – xüsusda, xüsusunda, haqqında. *Bu barədə fikriniz nədir? Bu məsələ barəsində mən heç bir şey deyə bilmərəm. – Sultan bu sözlərdən sonra Bahadıra baxıb, onun bu barədə sözünü gözlədi.* N.Nərimanov. *Burada mənim söhbətim "Kimyagər" komediyası barəsindədir ki, bir gün o pyesi biz həvəskarlar, haman səhnədə mövqeyi-tamaşaya qoyurduq.* C.Məmmədquluzadə. *İkinci xahişim odur ki, baş aqronom Məcid Əlyarov barəsində yazdığım əmri təsdiq elə.* M.Hüseyn. // Hər barədə, hər cəhətdən. *Hər kəs onun* [Mirzə Süleymanın] *yerində olsaydı, elə atasından inciyərdi, çünki kişi çox zəhmət çəkmişdi və hər bir barədə öz işini düzəltmişdi.* B.Talıblı.

**BARƏ**[2] *is.* [*fars.*] *köhn.* Bənd, sədd, səngər.

**BARƏ**[3] *is.* [*fars.*] Dil və diş üzərində əmələ gələn ağ qat; ərp.

**BARƏ**[4] *is.* [*fars.*] *köhn.* Gözəl və yaraşıqlı sərnişin gəmisi.

**BARGAH, BARGƏH** *is.* [*fars.*] *tənt.* 1. Saray; padşaha məxsus imarət. *Mübarəkbad sədası xalqdan asimanə büländ oldu və bargahın imarətlərindən əksi təkrar tapdı.* M.F.Axundzadə. [Altunbay:] *Dediklərində doğruya bənzər bir şey görsəm, bu günəşə gülümsər bargahı bayquşlar yuvasına .. çevirəcəyəm.* C.Cabbarlı. // Padşahın qəbul salonu. *Tehranda Ağa Məhəmməd şah öz bargahında əyləşib səndəl üstündə.* Ə.Haqverdiyev. // *köhn.* Böyük bir şəxsin hüzuru.

2. Liman, gəmi dayanacağı.

**BARXANA** *is.* [*fars.*] *köhn.* Ev şeyləri, ev ləvazimatı, müxəlləfat, avadanlıq, dirdirlik; başqa bir yerə aparılmaq üçün yığılıb bağlanmış şeylər, yük. *Barxana açıldı karvansarayə; At, qatırı mehtər çəkdi tövləyə.* Q.Zakir. *Xüsusən rəiyyət qismi böyük sovqatla gəlir, öz barxanalarını boşaldır*(*dı*). S.Rəhimov. *Hər kəs öz barxanasını alıb, bir kənara çəkilir.* Mir Cəlal.

**BÁRI** *əd.* [*fars.*] Heç olmasa. *O ha billəm gəlməz görməyə məni; Barı gendən tamaşaya gələydi.* M.P.Vaqif. [Qurban:] *Barı bu kasıblığıma görə arvadım göyçək olaydı; yenə dərd yarı idi.* Ə.Haqverdiyev. *Barı gedərkən bizə dəyəydin!* M.Rzaquluzadə.

**BARÍ** *is.* [*fars.*] Hasar, divar, sədd. *Uca barı. Barıdan aşmaq. Barı çəkmək. Daş barı.* – [Cahangir bəy:] *Mən haman Cahangir deyiləmmi bir top bez atdım barıdan, səni dustaqxanadan çəkdim divar üstə?!* N.Vəzirov. *Muzdur platforma kənar-larındakı alçaq barılardan birisinə söykənib dayandı.* S.M.Qənizadə. [Yaşar:] *Kəndimizin qabağından çay axır. Onu barı içərisinə almaq və elektrik stansiyası üçün istifadə etmək lazımdır*. C.Cabbarlı.

**BARILAMA** "Barılamaq"dan *f.is.*

**BARILAMAQ** *f.* Barı çəkmək, divar çəkmək, hasar çəkmək.

**BARILATMA** "Barılatmaq"dan *f.is.*

**BARILATMAQ** *icb.* Barı çəkdirmək, divar çəkdirmək, hasar çəkdirmək.

**BARINCI** *is. bot.* Paxlalılar fəsiləsindən olan alaq otlarından birinin adı.

**BARINDIRMAQ** *f.* Doydurmaq, yedirtmək, bəsləmək, yemləmək; himayə etmək, qorumaq.

**BARINQULU** *is. məh.* Sarı rəngli ətirli bir çiçək.

**BARINMA** "Barınmaq"dan *f.is.*

**BARINMAQ** *f.* Himayə altına girmək, sığınmaq, himayə olunmaq, mühafizə olunmaq, qorunmaq, yedirilib-içirilmək, bəslənmək. *Yaylağımda el barınar, gül bədənlər bəslənər; Obaların arxasında kəkliklərim səslənər.* M.S.Ordubadi. [Məsmə:] *Bu yandan da uşaq ac-susuz buralarda qalıb nə yeyəcək, nə barınacaq*. Mir Cəlal.

**BARIŞ** *is.* Barışma, uzlaşma, barışıq, sülh.

**BARIŞDIRICI** *sif.* və *is.* Barışdıran, iki düşmən arasında sülh və ya küsülülər arasında yenidən dostluq və səmimilik yaradan.

**BARIŞDIRMA** "Barışdırmaq"dan *f.is.*

**BARIŞDIRMAQ** *f.* 1. Düşmənçilik edən tərəflər, yaxud bir-birindən küsənlər arasında sülh və sazişi, dostluq və səmimiyyəti yenidən bərpa etmək, aralarını düzəltmək. *Düşmənləri barışdırmaq. Küsülüləri barışdırmaq. – Bu* [üzük] *qırıq könüllərinizi birləşdirir, küskün ruhlarınızı barışdırır.*

H.Cavid. *Ancaq Rəhim bəy ilə Səlim bəy qaldılar ki, ər ilə arvadı barışdırıb getsinlər.* S.S.Axundov.

2. *məc*. Uyğunlaşdırmaq, müvafiqləşdirmək, uzlaşdırmaq. *Ziddiyyətləri barışdırmaq. – Miçurin çalışırdı ki bir-birini qəbul etmək istəməyən və ayrı-ayrı növlərə məxsus olan cinsi hüceyrələr arasındakı bu kəskin ziddiyyəti aradan qaldırsın, yəni onları bir-biri ilə barışdırsın*. M.Axundov.

**BARIŞIQ** *is*. 1. Sülh, barış; uzlaşma, saziş. // Müharibə edən tərəflərin müharibəni dayandırmaq haqqında razılığı, sazişi. *..Şəki hökmdarı Hüseyn xan Müştaq oğlu Məmməd Həsən xanı Əbdülqədirin yanına göndərib, barışıq təklif etmişdi.* Çəmənzəminli.

2. Ölkənin dinc həyatı; sakitlik, əmin-amanlıq.

**BARIŞIQÇI** *is*. Barışdırmaq üçün küsülülərin arasına girən adam, barışdırıcı.

**BARIŞMA** "Barışmaq"dan *f.is.*

**BARIŞMAQ** *f.* 1. Aralarındakı mübahisəni kəsmək; incikliyi, ədavəti, düşmənçiliyi, küsülülüyü aradan qaldırmaq, əvvəlki dostluq və münasibəti bərpa etmək. *Küsülülər barışdılar. – Buna görə də Kəyan hökmən Cuma ilə barışmaq, .. onu özünə müavin etmək istəyirdi*. Ə.Əbülhəsən. // Müharibədən, mübarizədən, vuruşmadan əl çəkmək. *Müharibə edən dövlətlər barışdılar.*

2. *məc*. Uzlaşmaq, yollaşmaq, razılaşmaq, sazişə gəlmək. *Müttəfiqlər öz müvəffəqiyyətlərini bölüşdürmək üçün barışa bilmədilər.* M.S.Ordubadi. *Nifrətlə sevgi necə də uyğunlaşıb barışa bilər..* S.Rəhimov.

3. *məc.* Dözmək, qatlaşmaq, təhəmmül etmək, saziş etmək, razı olmaq, müqavimət göstərməmək. *Vəziyyətlə barışmaq*. *– Dəmirovun beləcə əsəbiləşdiyini, barışdığı məsələlər barəsində belə səs-küy etməsini də eşitmək və görmək olardı.* S.Rəhimov.

**BARIŞMAZ** *sif.* 1. Heç bir sazişə, heç bir sülhə yol verməyən; kəskin, amansız. *Barışmaz münasibət. – Yalnız kiçik bir yazıçı qrupu "Molla Nəsrəddin" jurnalı ətrafında toplaşaraq, Azərbaycan dilini osmanlılaşdıranlarla açıq və barışmaz mübarizə aparırdı.* Ə.Haqverdiyev.

2. Uzlaşdırıla bilməyən, birləşdirilə bilməyən, uyğunlaşdırıla bilməyən.

**BARIŞMAZLIQ** *is*. 1. Heç bir sazişə, heç bir sülhə yol verməməzlik.

2. *məc*. Qətilik, amansızlıq. *Mübarizədə barışmazlıq.*

**BARIT** *is*. Odlu silahlardan ötrü patron, mərmi hazırlamaq üçün partlayıcı maddə. *Tüstüsüz barıt. Ağ barıt. Barıt tüstüsü. Barıt iyi.*

◊ **Barıt qoxusu gəlir** *məc.* – müharibə gözlənilir. **Barıt kimi açılmaq (partlamaq)** – dərhal hirslənmək, özündən çıxmaq, qışqırmaq, bağırmaq. *Hacı bu sözləri dedikdən sonra xeyli dinmədi, birdən barıt kimi partladı.* M.S.Ordubadi. [Pirqulu:] *Əşi, nə oldu sənə, yenə barıt kimi partladın?* C.Cabbarlı. *Aslan birdən barıt kimi açıldı.* S.Rəhimov. **Barıtı quru saxlamaq** *məc.* – müharibəyə, müdafiəyə həmişə hazır olmaq. **Biratımlıq barıtı varmış** – hünəri, bacarığı çatmayan, tez coşub tez də soyuyan, yaxud hirsi, acığı tez soyuyan, tez yumşalan adam haqqında. **Burnuna barıt iyi dəyməmiş** – təcrübəsiz; müharibə, döyüş görməmiş adam haqqında.

**BARITÇI** *is. köhn.* 1. Barıt qayıran, barıt ustası.

2. Barıt satan adam.

**BARITXANA** *is*. 1. Barıt emal olunan yer, barıt fabriki.

2. Barıt saxlanılan yer, barıt anbarı.

**BARITI** *sif.* Barıt rəngində olan.

**BARITQABI** *is.* Barıt saxlamaq üçün qab (qutu, kisə və s.).

**BARITLAMAQ** *f. dan.* Barıt tökmək, barıt doldurmaq.

**BARITLIQ** *is*. 1. Barıt tökmək üçün qutu və s.; barıtqabı.

2. Patronun, mərminin, pistonlu tüfəngin və s.-nin barıt tökülən yeri.

**BAR(İ)-İLAHA, BARİ-İLAHİ** *nida* [*ər.*] *köhn.* Ay Allah, ilahi, ey tanrı mənasında xitab. *Vaqifə rəhm eylə, bari-ilahi! Agah et dərdindən ol üzü mahi.* M.P.Vaqif. *Zindəganlıq mənə düşvardı bundan sonra; Bar-ilaha mənə gəlsin, o ki, canana gəlir*. Q.Zakir.

**BARİQƏ** *is*. [*ər.*] *şair. tənt.* Şimşək, ildırım parıltısı; parıltı, işıq.

**BARİTÓN** [*ital.*] *mus.* 1. Yüksəkliyinə görə tenor ilə bas arasında kişi səsi. // Sif. mənasında. *Bariton səs*.

2. Bu cür səsi olan müğənni.

3. Trubadan bir oktava aşağı səslənən, nəfəslə çalınan mis musiqi aləti.

**BARÍT** [*yun.*] Barium-sulfat; ağ boyalar və kimyəvi maddələr hazırlamaq üçün sənayedə və s.-də işlədilən açıqrəngli ağır şpat.

**BÁRİUM** [*lat.*] *kim.* Gümüşü-ağ, yaxud sarımtıl rəngli qələvi metal; kimyəvi element.

**BARİZ** *sif.* [*ər.*] Aşkar, aydın, əyani, qabarıq, gözəçarpan. *Bariz dəlillər. – Atanın bu xasiyyətləri qızı ilə qarşılaşdığı zaman daha bariz bir şəkildə meydana çıxır.* M.Arif.

**BARJ** [*fr.*] Yastıdibli, enli, adətən yedəkdə aparılan böyük yük gəmisi. *Beş motorsuz barj motorlu gəmiyə çevriləcəkdir.* (Qəzetlərdən).

**BARKARÓLA** [*ital.*] Venetsiya qayıqçılarının mahnısı. // Çalınmaq, ya oxunmaq üçün bu mahnı üslubunda yazılmış musiqi əsəri. *Çaykovskinin barkarolası.*

**BARKÁS** [*holl.*] Liman daxilində işləyən kiçik buxar gəmisi, yaxud mühərrikli gəmi. *Ən uşaqlıqdan möhnətə adət etmiş Məşədi Əsgər gəmiçilik işinə mahir olduqda, özü üçün bir barkas alıb işləməyə şüru etdi.* S.M.Qənizadə. [Hüseyn] *gözlərini qaranlığa zilləyərək baxdıqca kiçik bir barkas, dalğalar, yelkənlər və bunların arasında atasının mehriban siması gözləri qarşısında canlanırdı.* S.Rəhman.

**BARKEŞ** *sif.* [*fars.*] *köhn.* Yükdaşıyan; yükçəkən; ağır şeyləri daşıyan, qaldıran (adətən klassik şeirdə dərdə, möhnətə, mənəvi əzablara dözən mənasında). *Dərdü qəm barkeşiyəm, köhnə peşənkəm sənə nə?* Aşıq Hüseyn.

**BARLANMA** "Barlanmaq"dan *f.is.*

**BARLANMAQ** *f.* 1. Meyvə (bar) gətirmək, məhsul gətirmək.

2. *məh.* Kiflənmək, bar bağlamaq (b a x **bar**$^3$ 1-ci mənada).

3. *məh.* Ərp bağlamaq. *Dişləri barlanmışdır.*

**BARLI** *sif.* 1. Meyvəli, məhsullu, bargətirən, meyvəverən. *Əlinlə qurduğun barlı bağçalar; Tufanlar qopsa da saralıb solmaz.* S.Vurğun.

2. Gəlirli, xeyirli, mənfəətli, səmərəli.

**BARMAQ** *is.* 1. İnsanın və bəzi heyvanların əl və ayaqlarının qurtaracağındakı beş mütəhərrik üzvdən hər biri. *Baş barmaq. Şəhadət barmağı. Orta barmaq. Adsız barmaq. Çeçələ barmaq. Barmaqlarının ucunda* (yavaşca, ayaqlarının altını yerə vurmadan). // Əlcəkdə barmaq keçirilən yer.

2. Maşın və mexanizmlərin milə oxşar girdə hissəsi – detalı. // Ümumiyyətlə, barmağa oxşayan hər şey.

3. Təkərlərin dəndənəsindən çənbərinə qədər uzanan çubuqların hər biri.

4. Məhəccər, sürahi ağacı.

5. Yaba və şananın hər bir dişi, ucu.

6. Barmaq uzunluğunda, barmaq boyda. [Kərim baba] *çubuğun ortasından iki barmaq qədər kəsib, üstünü götürdü.* A.Şaiq. // Adətən "bir", "bircə" sözləri ilə – azacıq, çox az, çox kiçik, çox xırda, bir tikə. *Beləcə Mahmud bircə barmaq kağız tapmaq fikri ilə yan-yörəsinə baxa-baxa su başına çatdı.* Ə.Əbülhəsən. // Qatı bir mayeyə batırıldıqda bir barmağın aldığı miqdar. *Bir barmaq doşab.* – [Qaymaqdan] *bir barmaq yediyi üçün Nadiri döyürlər, söyürlər..* Mir Cəlal.

7. Şeirdə: heca ölçüsü, misralardakı hecaların sayına əsaslanan ölçü.

8. *dan.* Çalğıçının əsas musiqi melodiyasına uyğun olaraq əlavə etdiyi ahəng. // Simli musiqi alətində (tar, kamança, saz və s.) çalan müəyyən ifaçının işlətdiyi və yalnız ona xas olan xırda musiqi ibarələri. *Müxtəlif növlü çalğı alətlərində birgə çalmağa başladıqda, hər çalğıçı öz musiqi alətinin xüsusiyyətlərindən asılı olaraq, həm də öz bacarığını daha qabarıq surətdə nümayiş etdirmək üçün çalınan musiqinin əsas melodiyası ilə həmahəng olan yeni "guşələr", "xallar", "barmaqlar" əlavə etməyə çalışmışdır.* Ə.Bədəlbəyli. ☐ **Barmağı yatmamaq** – çalmağı öyrənə bilməmək, çalğı alətində ahəngi tuta bilməmək. [Tələbə:] *Getdim girdim tar dərnəyinə, tar çalmağa da barmağım yatmadı.* Qantəmir.

9. Tənək, nar və s. bu kimi kolların, yaxud çiçəklərin şitil çubuğu.

◊ **Barmağı dişində** – heyrət içində, matməəttəl. **Barmağı olmaq** – əli olmaq, xəbəri olmaq, bir işin gizli iştirakçısı olmaq

(adətən mənfi mənada). *Bu işdə yəqin onun da barmağı var.* **Barmağına dolamaq** – ustalıqla aldatmaq, tovlamaq, ələ salmaq, oynatmaq, sarımaq. **Barmağını dişləmək** – nə isə bir şey yadına düşərək fikrə getmək; anlamaq, duymaq, başa düşmək. *Nəriman barmağını dişlədi, əli ilə başına vurdu.* Mir Cəlal. *Mən barmağımı dişlədim, anamın qolundan tutub içəri apardım.* İ.İbrahimov. **Barmaq silkələmək** – hədələmək, qorxutmaq. **Barmaq uzatmaq** – başqasının işinə qarışmaq. **Barmaq yeri** – bəhanə, girəvə. **Barmaqla göstər(il)mək** – məşhur olmaq, tanınmaq, adı çıxmaq (yaxşılıqda, ya pislikdə). *Bütün kənddə Nazlını barmaqla göstərirdilər.* M.İbrahimov. **Barmaqla sayılmaq** – çox az şey haqqında. *Onunçun da indiyədək bizlərdə cürət eləyib ələ qələm alanlar barmaqla sayılıbdır.* C.Məmmədquluzadə. **Beş barmağı kimi tanımaq** – çox yaxşı tanımaq, bilmək, bələd olmaq, təfərrüatına qədər bilmək. [Mahmud xan:] *Mən adamlarımı beş barmağım kimi tanıyıram.* M.S.Ordubadi.

**barmaq-barmaq,** *zərf* Az-az, kiçik hissələrlə, hissə-hissə. *Barmaq-barmaq oğurlayan, qarış-qarış oğurladar.* (Məsəl).

**BARMAQARASI: barmaqarası baxmaq** – fikir verməmək, saymamaq, xor baxmaq, əhəmiyyət verməmək, laqeyd baxmaq.

**BARMAQCIQ** "Barmaq"dan *kiç.*

**BARMAQCIL** *is.* 1. Barmağa taxılan bəzək şeyləri (üzük).

2. Bax **barmaqçalıq.**

**BARMAQÇA** bax **barmaqçalıq.**

**BARMAQÇALIQ** *is.* 1. Bax **barmaqlıq** 3-cü mənada.

2. Qaşsız üzük (keçmişdə baş barmağa taxardılar).

**BARMAQHESABI** *dan.* 1. *sif.* Barmaqla sayılan, hesablanan. *Barmaqhesabı hesablamaq.* ☐ **Barmaqhesabı göstərmək** – hesabda aldatmaq, kələk gəlmək.

2. *is.* Heca vəzninin danışıqda işlənən adı.

**BARMAQLAMA** "Barmaqlamaq"dan *f.is.*

**BARMAQLAMAQ** *f.* Barmağını toxundurmaq, barmağını batırmaq; barmaqla götürüb yemək. *Uşaqlar balı barmaqlaya-barmaqlaya* (z.) *qurtardılar.*

**BARMAQLANMAQ** "Barmaqlamaq"dan *məch.*

**BARMAQLI** *sif.* Barmaqları olan. *Barmaqlı əlcək.*

**BARMAQLIQ** *is.* 1. Ağacdan, dəmirdən və ya məftildən qayırılmış tor, hörgü. *Pəncərə barmaqlığı. Balkon barmaqlığı. Bağça barmaqlığı.* – [Fərhad] *cəld ayağa durub, dəmir barmaqlığa yanaşdı.* M.Hüseyn. *Dayadıq alnımızı dəmir barmaqlıqlara; Günəş gözlərimizlə baxdıq qaranlıqlara.* S.Rüstəm.

2. Üzük.

3. Zədələnməmək, sürtülməmək üçün biçinçilərin və b.-nın barmaqlarına keçirdikləri dəri kisəcik və s.

**BARMAQSIZ** *sif.* Barmağı, yaxud barmaqları olmayan. *Barmaqsız əl.*

**BARMAQVARİ** *sif.* Barmağa oxşayan, barmağa bənzər.

**BARÓKKO** [*ital.*] XVI-XVIII əsrlərdə Avropada yayılmış çox təmtəraqlı incəsənət (*memarlıq*) üslubu.

**BARÓQRAF** [*yun.*] Öz-özünə yazan barometr; hava təzyiqini avtomatik surətdə və arasıkəsilmədən qeyd edən cihaz.

**BARÓMETR** [*yun.*] Hava təzyiqini ölçmək, onun dəyişəcəyini qabaqcadan bilmək və dəniz səthinə nisbətən yerin səviyyəsini müəyyən etmək üçün cihaz. *Ruzgarın pişəzvəqt dəyişilməsini bilməkdən ötrü bir alət ixtira ediblər ki, adına mizanülhava* (*barometr*) *deyirlər.* H.Zərdabi. *Qüdrət yan divardan asılmış barometrə tez-tez baxırdı.* M.Hüseyn. // *məc.* Bir şeyin meyarı, göstəricisi mənasında.

**BAROMETRÍK** *sif.* 1. Barometr ilə ölçülən (müəyyən edilən). *Barometrik təzyiq.*

2. Hava təzyiqinə aid və onunla əlaqədar olan.

**BARÓN** [*fr.*] Qərbi Avropada və bolşevik inqilabına qədər Rusiyada qrafdan aşağı zadəgan rütbəsi və bu rütbənin sahibi olan adam. *Piqasov Rudinə müraciətlə sözə başladı: – İcazə verin, soruşum, cənab baronun göndərdiyi məqalənin məzmunu?* Turgenevdən. [Əmiraslan ağa:] *Mənim oğlum rusların knyaz, qraf, baron .. övladlarından artıq və əzizmidir?* S.S.Axundov.

**BARONÉSSA** [*fr.*] Baron arvadı, ya qızı.

**BARONLUQ** *is.* Baron rütbəsi.

**BARRİKÁDA** [*fr.*] Küçə vuruşmasında inqilabi kütlələrin müxtəlif iri şeylərdən (şalban, içi torpaqla dolu kisələr, daş, ağac və s.-dən) düzəltdikləri səngər; küçə səngəri. *Barrikada vuruşmaları. Barrikada düzəltmək. – Barrikadaları qurur yan-yana; Deyir ki, olmaram təslim düşmana.* M.Rahim.

**BARSIZ** *sif.* 1. Meyvəsiz, məhsulsuz. *Barsız ağaca daş atmazlar*. (Ata. sözü).

2. *məc*. Səmərəsiz, xeyirsiz, faydasız.

**BARSIZLIQ** *is.* 1. Meyvəsizlik, məhsulsuzluq.

2. *məc*. Səmərəsizlik, xeyirsizlik, faydasızlıq.

**BARVERİCİ** *sif.* Meyvə verən, bar verən, bəhər verən, məhsuldar.

**BAS** [*ital.*] *mus.* 1. Ən bəm kişi səsi. // Belə səsi olan müğənni.

2. Çoxsəsli musiqi əsərinin ən alçaq səslə ifa edilən hissəsi.

3. Ən aşağı registrdə səslənən musiqi alətləri. // Musiqi alətinin aşağı səs çıxaran simləri, dilləri.

**BASABAS** *is.* Basırıq, qələbəlik, tünlük; sıxıntıda bir-birini yana basma, sıxma, sıxcalama. *Axşam saat on birdə Məşədi Kazım ağa gəldi, basabasda başmağının bir tayı ilə bərabər börkünü itirmişdi.* M.S.Ordubadi. *Vaqonlarda basabas idi*. Mir Cəlal. // Qarışıqlıq, nizamsızlıq, pozğunluq, hay-küy. *Basabas düşdü. Basabas eləmək.*

**BASARAT** *dan.* b a x **bəsirət.** ☐ **Basaratı bağlanmaq** – görə bilməmək, seçə bilməmək, duya bilməmək; qafil olmaq, həqiqəti görməmək.

**BASBAS** *is. məh.* Yaş meyvələri, ya yağlı dənləri sıxıb, suyunu və ya yağını çıxaran alət; çənçərə.

**BAS-BOŞ** *is. xüs.* Neft quyuları qazıldığı və ya təmir edildiyi zaman boru, ştanq və s.-ni quyuya endirib qaldırma prosesini bildirən söz, istilah. *Yoxlayıcının quyuda işləməsi qazıma borularının bas-boş edilməsi ilə və içərisinə metal çubuğun tullanması ilə təmin olunur.* Quliyev. [Kərim:] *Bir quyunun qazılmasına gedən vaxtın yarıdan çoxunu bas-boş və başqa işlər aparır*. M.İbrahimov.

**BASDA(LA)MA** “Basda(la)maq”dan *f.is.*

**BASDA(LA)MAQ** *dan.* b a x **basmaq** 2-ci mənada. [Şofer] *lakin Xəlildən cavab almayıb, onu basdalamaq istəyirmiş kimi, maşını düz onun üstünə sürdü.* M.Hüseyn.

**BASDALANMAQ** b a x **basılmaq.**

**BASDI-KEÇDİ** *is. dan.* Zorbazorluq, hərki-hərkilik, qanunsuzluq, başlı-başınalıq.

**BASDI-KƏSDİ** *is.* Yalandan özünü qoçaq, igid göstərmə; gop, gopçuluq.

**BASDIRIQ** *is. dan.* 1. B a x **basırıq**.

2. Dar gün üçün gizlədilmiş pul, şey və s. *O deyir ki, gec-tez mülklərinin hamısını qaytaracaqlar, heç qaytarmasınlar. Basdırığım sağ olsun..* N.Vəzirov.

**BASDIRILMA** “Basdırılmaq”dan *f.is.*

**BASDIRILMAQ** “Basdırmaq”dan *məch*.

**BASDIRMA[1]** *is.* 1. “Basdırmaq”dan *f.is.*

2. Soğan, istiot və duza qoyulmuş ət və bu ətdən hazırlanan xörək. // Ümumiyyətlə, qovrulub, ehtiyat üçün qışa saxlanılan ət.

**BASDIRMA[2]** *is. məh.* Doqqazların yan tərəfində yerə basdırılan deşikli ağac.

**BASDIRMAQ** *f.* 1. Əkmək, sancmaq. *Ağac basdırmaq. Dirək basdırmaq.* – [Fəxrəddin:] *Çox pakizə .. sübh tezdən hamısını basdıraram*. N.Vəzirov.

2. Quyulamaq, torpağa gömmək. *Ölü basdırmaq. – Biz onu* [Azadı], *öz vəsiyyətinə görə, uca bir yerdə basdırdıq*. M.İbrahimov. [Nəsib kişi:] *Yeddi uşaqdan üçünü basdırmışam.* Mir Cəlal.

3. Üstünü örtmək. [Sübhanverdizadə] *yerə uzanıb yastığa söykəndi. Nemətullayev onun yan-yörəsini basdırdı.* S.Rəhimov. // Məc. mənada. *Cinayətin üstünü basdırmaq*. // Torpağın altında gizlətmək. ..*Veylabad şəhəri elə bil dəyişmişdi, hərə bir tərəfə qaçıb dağılmaqda idi .. Sərvətlilər qızıllarını basdırırdılar.* Çəmənzəminli.

4. Qatlayıb tikmək. *Paltarın ətəyini basdırmaq.*

5. Dişi heyvanı erkək heyvanla cütləşdirmək.

6. Cücə çıxartmaq üçün yumurtaları kürt toyuğun altına qoymaq.

7. Otarmaq, tapdalatmaq, əzdirmək. *Əkini mal-qaraya basdırmaq.*

8. *köhn.* Dərc etdirmək, çap etdirmək. *İlk şerimi – məktəbimin qəzetində basdırdım.* S.Rüstəm.

**BASDIRMIŞ** “Basdırmaq”dan *f.sif.*

**BASDIRTMAQ** *icb*. Üçüncü şəxs vasitəsilə basdırmaq.

**BASƏFA** *sif.* [*fars.* ba... və *ər.* səfa] Səfalı, könülaçan. *Amma bura da çox basəfa yerdir ha!* Ə.Haqverdiyev. *Yaylağa gələn adamların çoxu şəhərə, kəndə getmirdi. Basəfa yer seçib, buralarda .. düşürlər*. Mir Cəlal.

**BASƏVAD** *sif.* [*fars.* ba... və *ər.* səvad] *köhn.* Savadlı, savadı olan, yazı-pozu bilən. *Amma hər kəs bu dillərin heç birində basəvad deyil, yəqin ki, bilməyəcək nə deyirik.* C.Məmmədquluzadə.

**BASICI** *sif.* Basan, təzyiq edən, sıxıcı. *Qanayan qolu və qıçı qaldırıb hündür vəziyyətdə saxlamaq və oraya basıcı sarğı qoymaq yolu ilə qanaxmasını dayandırmaq mümkün olur*. Babayev.

**BASIQ** *sif.* 1. Yastı, çökük; basılmış, sıxılmış halda olan, batıq.

2. Yük heyvanlarının belində əzilməkdən əmələ gələn yara.

**BASIQLIQ** *is.* Basılmış, sıxılmış, yastılanmış, çökmüş şeyin halı; yastılıq, çöküklük, batıqlıq.

**BASILIŞ** *is.* 1. Basmaq işi.

2. *köhn.* Çap, nəşr. *Kitabın üçüncü basılışı.*

**BASILMA** “Basılmaq”dan *f.is.*

**BASILMAQ** 1. “Basmaq”dan *məch. Biz işdən çıxanda “Molla Nəsrəddin”in birinci nömrəsinin min ədədi basılıb tamam oldu.* C.Məmmədquluzadə.

2. *t-siz*. Məğlub olmaq. *Düşmən basılandan sonra Giziroğlu başında atlısı geri qayıtdı.* “Koroğlu”. *Yarışda basılmamaq üçün hamımız cidd-cəhdlə işə girişməliyik.* S.Rəhman.

3. *t-siz.* Çuxura düşmək, çökmək. *Uzun zaman əzələlər fəaliyyətsiz qaldıqda, insan bədəninin forması dəyişir və təndürüstlüyü pozulub, donqarlıq əmələ gəlir, qarın qabağa çıxır, döş basılır və s.* Babayev.

**BASILMAZ** *sif.* 1. Basılması mümkün olmayan, basıla bilməyən, məğlub edilə bilməyən, məğlubedilməz. [Yasavul] *özünü .. aşılmaz bir dağ, basılmaz bir qala sayır.* S.Rəhimov.

2. Rəfedilməz, rəf edilə bilməyən, ortadan qaldırıla bilməyən. *Alyoşa basılmaz bir qüvvətlə Sübhanverdizadənin üstünə düşdü*. S.Rəhimov.

**BASILMAZLIQ** *is*. Məğlubedilməzlik.

**BASILMIŞ** *f.sif.* 1. Üstdən sıxılmış, təzyiq altında qalmış.

2. Məğlub edilmiş, məğlub olmuş. *Basılmış ordu.*

3. Soxulmuş, qoyulmuş, tıxanmış, yerləşdirilmiş. *Çamadana basılmış paltarlar.*

4. *köhn*. Çap edilmiş, nəşr edilmiş. *Basılmış kitab.*

**BASIM su basımı** – gəminin öz çəkisi ağırlığında olaraq sıxışdırdığı suyun miqdarı. *Gəminin su basımı 13 min tondur.* (Qəzetlərdən).

**BASIRIQ** *is*. Sıxlıq, adam çoxluğu, tünlük, basabas, qələbəlik. *Orada basırıq vardır. – Mədənin qapısı çox basırıq idi.* M.S.Ordubadi. *Basırıq və hay-küy içində bir uşaq naləsi eşidildi*. M.İbrahimov. *Ümumiyyətlə, hamam xəzinələrinin qapısı kiçik olduğundan burada daima basırıq olardı*. H.Sarabski. // Sıxıntı, darısqallıq. *O basırıqda iş görmək olmur*. // Nizamsızlıq, törtöküntü. *Bu basırıqda heç şey tapmaq olmaz.*

**BASİ́L** [*lat.*] *mikrob.* Çöpşəkilli bakteriya.

**BASİRƏ** *is*. [*ər.*] Görmə qüvvəsi, görmə qabiliyyəti. // Göz.

**BASKETBÓL** [*ing.*] *idm.* Topun, dirəkdən asılmış tora (səbətə) əl ilə salınmasından ibarət oyun. *Basketbol üzrə yarış. Basketbol komandası. – Basketbol bir çox əzələ qruplarını inkişaf etdirir zirəklik, təsirə qarşı tez cavab vermək, dürüst və çevik hərəkət etmək kimi sifətləri tərbiyə edir.* Babayev.

**BASKETBOLÇU** *is. idm.* Basketbol oynayan idmançı.

**BASQI** *is.* Basmaq işi, təzyiq. // Basan, ağırlıq edən şey. *Mexaniki üsulla taxta hazırlayan elmi-tədqiqat institutu basqı üsulu ilə mebel hazırlamaq işini qaydaya salmışdır*. (Qəzetlərdən).

**BASQIN** *is*. 1. Ansız hücum; qəfildən, gözlənmədən edilən hücum. [Sərirdə yaşayan] *.. dağlılar çöllülərə nisbətən daha şücaətli*

*olduqlarından, xəzərlər üzərinə basqın edərək, onları qarət edirdilər*.

2. Talan, çapovulçuluq. [Vəli:] ..*Səfiqulu xan öz dəstəsi ilə gəlib, basqın eləyib bir çobanımızı yaralayıbdır*. N.Vəzirov. [Cənubi] *Azərbaycanın hər tərəfində basqınlar, yolkəsmələr, qarətlər başlandığından, çar konsulunun .. Qulusultanın ölüm səbəblərini aydın etməyə macalı qalmamışdı.* M.S.Ordubadi.

**BASQINCAQ** *is*. Uşaqların əylənmək üçün iki başında oturaraq, üzərində qalxıb düşdükləri tir; batman-tərəzi.

**BASQINÇI** *is*. Soyğunçu, qarətkar, quldur, yolkəsən, çapovulçu. *Basqınçıların təqibindən qaçıb bu dağlara sığınmış xınalıqlılar quraqlıq illərində sudan çox korluq çəkirlərmiş*. R.Rza.

**BASQINÇILIQ** *is*. Soyğunçuluq, qarətkarlıq, quldurluq, çapovulçuluq; çapovul, yolkəsmə. *Ərəbistan çöllərində bir zaman; Basqınçılıq, soyğunçuluq olardı*. M.Rahim.

**BASQINTI** b a x **basqın.**

**BASMA[1]** 1. "Basmaq"dan *f.is.*

2. *sif.* Üzərinə müxtəlif naxışlar, rəng və s. basılmış. *Basma çit. Basma sətin. Basma kəlağayı*. // *is*. Parça üzərində naxış. *Qanovuz köynəyin atlaz çutqusu; Yaşıl basmaları nə gözəl imiş*. Aşıq Abbas.

3. *sif. köhn*. Çap edilmiş, mətbəə və ya basma üsulu ilə hazırlanmış; mətbu (*əlyazma* əksi). *Basma kitab*.

4. *sif*. Basılmış, sıxılmış (şey). // *is*. Kərpic şəklində sıxılıb, qurudulmuş mal təzəyi.

5. *is*. Yazı qurulayan kağız, suçəkən kağız. // Yazını qurutmaq üçün üzərinə hopdurucu kağız parçası keçirilmiş alət; pres.

6. *sif*. Bir-birinin içinə keçirməklə bağlanan.

7. *is. məh.* Buxarı və ya ocaq bacasının kənarı.

8. *is. məh.* Kömür hazırlamaq üçün yığılmış odun qalağı.

9. *is. məh*. Balaca çay və arxlardan keçmək üçün suya tökülən şax budaq; şax və çırpıdan qayrılan körpü.

**BASMA[2]** *is*. Saç boyamaq üçün rəng.

**BASMA[3]** *is. tar.* Rusiyada monqol-tatar istilası dövründə: üzərində tatar xanının şəkli olan möhür.

**BASMAÇI[1]** *is*. Basma işi ilə məşğul olan adam, qəlib basan adam (b a x **basma[1]** 2-ci mənada).

**BASMAÇI[2]** *is. və sif.* [*özb.*] *tar*. Orta Asiyada basmaçılıqda iştirak etmiş adam (b a x **basmaçılıq**). [Türkmənlər] .. *bütün basmaçı hissələrini dağıtdılar*. Ə.Sadiq.

**BASMAÇILIQ** *is*. [*özb.*] *tar*. 1917-26-cı illərdə Orta Asiyada sovet hakimiyyətinin devrilməsi uğrunda silahlı milli hərəkat. *Basmaçılığın ideoloji əsası.*

**BASMADÜYMƏ** *is*. Bir-birinin içinə keçən iki metal hissədən ibarət düymə.

**BASMAXANA** *is*. [basma və *fars*. ...xanə] 1. *köhn*. Çapxana, mətbəə. *İran xalqı dünən basmaxana bina edib..* M.F.Axundzadə.

2. Ağ toxunmuş parçaya naxış basılan yer (sex, şöbə).

**BASMAQ** *f*. 1. Üstdən sıxmaq, təzyiq etmək, ağırlıq vermək. *Qar basıb, ağacın budağını yatırdı. – Nəriman .. bu adamın əllərini tutdu, dizi ilə boğazını basdı..* Mir Cəlal. // Sıxışdırmaq, itələmək. *Seyid Əhməd Seyid Səmədi görən tək camaatı basa-basa* (z.) *ona tərəf yüyürdü.* Ə.Haqverdiyev..

2. Tapdalamaq, ayaqlamaq, basdalamaq. *Qarları basa-basa* (z), *dağları aşa-aşa iki nəfər təhkimçi gəldi.* Mir Cəlal..

3. Altına alıb şikəst etmək, əzmək, ya öldürmək. *Avtomobil adam basdı. Qatar inək basdı. At uşağı basıb. – Faytonçu atları saxlaya bilməyib, Nurəddini basdı*. S.S.Axundov.

4. Qalib gəlmək, məğlub etmək. *Düşməni basmaq.* // Ötmək, birinciliyi qazanmaq, üstün gəlmək. *Uzun pəhləvan balacanı basdı. – Qara məni basınca, mən qaranı basım.* (Ata. sözü). [Movlamverdi:] *Bəli, bəli, işin həqiqəti budur ki, qara ləkə ağ ləkəni basmasın*. C.Məmmədquluzadə.

5. Soxmaq, tıxamaq, dürtmək, təpmək. *Şeyləri çamadana basmaq. Pulu cibinə basmaq.* – [Musa kişinin] *yalnız ağzına dəsmal basdıqda səsi eşidilməz oldu*. M.İbrahimov. *Nəhayət, bütün fəhlələr köməkləşib, qapağı quyunun ağzına basa bildilər*. M.Hüseyn.

6. Qoymaq, keçirmək, geymək. *Xan acığından şəbkülahını başına basıb, bir az vəhşi heyvanlartək nərildədi*. Çəmənzəminli.

7. Batırmaq, içinə salıb islatmaq. *Gönü suya basmaq.*

8. Bürümək, qaplamaq, əhatə etmək, qabağını tutmaq, görünməz hala salmaq. *Dağları çən basıbdır. Ətrafı tüstü basıb, göz gözü görmür. Göy üzünü bulud basıbdır.* // Doldurmaq, yayılmaq. *Ətrafı səs basmışdır. Onun şöhrəti aləmi basmışdır.*

9. Örtmək. *Otağın fərşi çoxdan bəri süpürülməmişdi. Künc-bucağı, tavanı hörümçək toru basmışdı.* M.S.Ordubadi. *Üstünü şeh və qırov basmış körpə otlar günəşin işıqları altında parıldayırdı.* M.İbrahimov. *Ayna .. yonca basmış bir cığırla kəndə doğru yönəldi*. Ə.Məmmədxanlı.

10. Bir şeyin çoxluğunu, sıxlığını, geniş sahə tutduğunu, yayıldığını bildirir. *Bağçanı kol-kos basıbdır. Pambığı alaq basıbdır. Sahili su basmışdır. Saqqal basmaq. Tər basmaq. – Qar basmış və ağarıb gedən çöllərdən və təpələrdən başqa bir şey gözə dəymirdi.* M.İbrahimov. *Xəlilin günəşdən yanmış buğdayı yanaqlarından, tük basmış sərt üzündən uzun müddət vuruşub yorulduğu dərhal sezilirdi*. M.Hüseyn.

11. *məc*. Boğmaq, cəbr etmək, zülm etmək, sıxışdırmaq. [Safo:] *Onlar* [varlılar] *fağırları basan, camaat üstünə xoruzlanan, böyük görəndə arxası yerdə, kiçik görəndə ayaq üstə kəkələnəndirlər*. S.Rəhimov.

12. Ansızın hücum etmək, üstünü almaq, üzərinə atılmaq. *Çar polisləri tətilçilərin evlərini basırdılar.* – [Silahlı adamlar] *qoşun gətirib, evi basmağa gəldilər.* M.S.Ordubadi.

13. Ağırlıq göstərmək, ağırlıqdan əyilmək. *Tərəzinin bir gözü basır, düzəldin.*

14. Vurmaq, qoymaq. *Möhür basmaq. Damğa basmaq. Naxış basmaq.*

15. Örtmək, qapamaq. *Qapını basmaq. Pəncərəni bas, toz gəlməsin*. – [Mirzə:] *Dörd ətrafı işıq tutan zaman qapıları basıb, camaatı işıqdan məhrum etməyin.* Ə.Haqverdiyev. [Məsum kişi] *dərhal qapını basıb, mətbəxə qayıtdı*. Mir Cəlal.

16. *məc. dan.* Özünü təriflәmək, öymək, goplamaq (*çox vaxt tərkiblərdə işlənir*). *Görün yenə nə özündən basır. Basıb bağlamaq. – Tərbiyəsiz uşaq kimi, boş-boşuna hırıldama; Baş-qulağın düzəlməyib, çox da basıb guruldama*. M.Ə.Sabir.

17. *dan. k.t.* Mayalandırmaq (heyvanlar haqqında).

18. Tutmaq; aramsız, dalbadal atmaq, üzərinə yağdırmaq. *Daşa basmaq. Gülləyə basmaq.* – [Molla Abbas:] *Axır mən haraya gedim? Uşaqlar məni daşa basır*. C.Məmmədquluzadə.

19. İtələmək, kənara çəkmək. *Arabanı irəli bas. Stolu bir az dala bas. Kitabları yana bas ki, yer açılsın.*

20. Yırtmaq, dağıtmaq, parçalamaq, öldürmək. *Canavar inək basıbdır. – İkindi çağı idi. Obada "Dursunu ayı basmış!" – deyə səs qopdu.* A.Şaiq.

21. Örtmək, keçmək, addamaq, aşmaq. *Əşrəf üç yaşına basmış*(*dı*). A.Şaiq.

22. Bir sıra isimlərə qoşularaq, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: yuxu basmaq, vahimə basmaq, bağrına basmaq, ayaq basmaq və s.

**BASMAQƏLİB** *sif. dan.* 1. Heç bir fikir işlənilmədən, kor-koranə təqliddən ibarət olan; şablon.

2. Başdansovma, atüstü, tələsik görülmüş.

**BASMALAMAQ** b a x **basmarlamaq.**

**BASMANAXIŞ** *is.*Üzərinə rənglənmiş xüsusi qəliblərin basılması ilə parçada naxış alınmasından ibarət qədim xalq sənəti növü; naxışvurma üsulu. *Basmanaxış üsulu ilə hazırlanmış Gəncə və Basqal kəlağayıları.*

**BASMARLAMA** "Basmarlamaq"dan *f.is.*

**BASMARLAMAQ** *f.* Birdən qaba surətdə basıb tutmaq, qamarlamaq, süpürləmək, tutmaq, sıxcalamaq. *Pişik siçanı basmarladı. – Onda gördük ki, Tərlan Məşədiağanın bir yanında bibisi oğlu Əyyubu basmarlayıb, cücə kimi altına alıbdır.* S.S.Axundov. *Ayaqyalın uşaqlar qara düşüb, çil toyuğu basmarlayıb tutdular*. S.Rəhimov.

**BASMARLANMA** "Basmarlanmaq"dan *f.is.*

**BASMARLANMAQ** *məch*. Birdən qaba surətdə basılıb tutulmaq.

**BAŞ** *is.* 1. İnsan bədəninin kəllə və sifətdən ibarət olan yuxarı hissəsi. *İri baş. Onun başı ilə bədəni arasında tənasüb yoxdur. – Baş bədənin tacıdır, gözlər onun daş-qaşı.* (Ata. sözü). // Heyvan bədəninin beyin olan yuxarı və ya ön hissəsi. *Toğlular başlarını qaldırıb, Quluya baxdılar və yenə də mərzdəki xırda göy otu yeməyə başladılar.*

M.İbrahimov. ☐ **Başı axmaq (dolanmaq)** – başı gicəllənmək, başı hərlənmək. **Başı çatlamaq** – başı bərk ağrımaq. **Başına vurmaq** *məc.* – beyinə təsir etmək. *Spirt başına vurdu.* **Başını çevirmək** – baxmamaq, görməmək üçün üzünü döndərmək. // Başın beyin və saç olan yuxarı hissəsi; kəllə, qafa. *Başına vurmaq. Daz baş. Başında bir dənə ağ tük yoxdur. Başına papaq qoymaq. – Başımdan ağrı qopur, gözlərimə qaranlıq çökür.* Mir Cəlal. **Başını sığallamaq** *məc.* – mehribanlıqla, nəvazişlə başına əl çəkmək.

2. *məc.* Zehin, şüur. *Başımda hər şey qarışdı. Belə bir şey heç başımda yox idi. Başıma yaxşı bir fikir gəldi.* // *məc. dan.* Ağıl, zəka mənasında. *Kişidə baş var.*

3. Bir şeyin ən yuxarı hissəsi, təpəsi, zirvəsi, üstü. *Qüllənin başı. Ağacın başına çıxmaq. – Tərlan kimi gözlərini zillədi; Dağ başından evin səmtin bəllədi.* A.Səhhət. *Dağların başında bulud qaynaşmağına baxmayaraq, hava isti idi.* Çəmənzəminli. *Ağacların başını axtardıq, zirzəmilərə adam saldıq.* Mir Cəlal.

4. Bir şeyin qalın, çıxıq, yumru ucu, təpəsi. *Vintin başı. Mıxın başı.* // Yumru şəkildə olan hər şey. *Bir baş soğan* (*kələm*).

5. Kənar, qıraq, yan. [Əbülhəsən bəy:] *Nə isə şam süfrəsinin başına keçdim.* M.S.Ordubadi. *Yuxuda görürəm ki, sərin bir bulaq başındayam.* M.Hüseyn. *Əkbər kişi kəhriz başında oturub sərinləyirdi.* Mir Cəlal.

6. Bir şeyin başlandığı yer, başlanğıc. *Çayın başı. Arxın başı. Kanalın başı. Yolun başı. Tarlanın başı.* – [Cahangir:] *..Gedib suyun başını pambığa sarı çevirsinlər.* Ə.Haqverdiyev. *Birdən tingə başından qəfildən bir dəstə qız onun qarşısına çıxdı.* Ə.Məmmədxanlı. // Müəyyən bir müddətin, hərəkət və ya hadisənin başlanğıcı, əvvəli, ibtidası. *İlin başı. Ayın başı. Gələn ayın başında burada olaram.* – [Hacı Kərim:] *Gərəkdir ki, gələn həftənin başında pullar hazır ola, yola düşək.* M.F.Axundzadə. *Yaz başı dolu yağardı.* Mir Cəlal.

7. Uzunluğu olan bir şeyin son nöqtəsi, ucu, qurtaracağı, kənarı, son hissəsi. *Xalçanın başı. Şalbanın başı çürümüşdür. Ağacın o biri başından tut. – Məhsəti xanımı istiqbal edən dəstələrin bir başı İsfahan kəndində, o biri başı isə .. Xanəgah kəndində dayanmışdı.* M.S.Ordubadi.

8. Bir şeyin ön tərəfi, qabaq tərəfi, qarşıda olan kənarı, yaxud əsas hissəsi. *Gəminin başı. Taxtanın başı hansıdır?*

9. Yuxarı tərəf, hörmətli yer. *Məclisin başı.* ☐ **Başa keçirmək** – məclisin yuxarısına keçirmək, birinci yerə keçirmək, ən hörmətli yerdə, başda oturtmaq, hörmətini qaldırmaq. **Başa keçmək** – məclisin yuxarısına keçmək, ən hörmətli yeri tutmaq, başda oturmaq. **Aşağı baş** – məclisin ikinci dərəcəli yeri, tərəfi. **Yuxarı baş** – məclisin ən hörmətli yeri, tərəfi. *Vaqiflə Mirzə Əliməmməd xalqa təzim edə-edə yuxarı başa keçib, göstərilən yerdə əyləşdilər.* Çəmənzəminli. *Bütün ailə onun* [Nazilə xanımın] *ayağına qalxdı, yu-xarı başa keçirdilər.* Mir Cəlal.

10. Heyvanları saymaq üçün hesab vahidi. *Beş baş inək. On baş qoyun. Kolxozun yüz baş qaramalı var. – Əgər qatıra minə bilsəydi, düzü, anamın qəbri haqqı, ona* [Bəxtiyə] *dörd baş düyə verəcəkdim.* S.Rəhimov.

11. Ailə üzvü, nəfər, adam mənasında. *Beş baş ailəm var.* – [Qulam dayı:] *Özümdən başqa altı başdır.* M.Hüseyn. [Rəis:] *Üç baş olana iki otaq! Beş başdan yuxarı üç otaq.* Mir Cəlal.

12. *sif.* Vəzifəcə böyük olan; başçı, rəhbər, birinci, böyük. *Baş mühəndis. Baş mühasib. Baş katib. Baş dirijor. – Baş həkim xəstənin bu sözlərindən daha da həyəcanlandı.* M.S.Ordubadi. *Muradxan fermanın baş çobanı idi.* İ.Əfəndiyev. ☐ **Baş olmaq** – bir işdə birinci olmaq, başçı olmaq. **Başda olmaq** – 1) b a x **baş olmaq;** 2) *məc.* əsas yeri tutmaq, birinci olmaq. *Orucluq ayının özünə məxsus süfrəsi vardı. Firni, tərək, bal halvası .. və sairə. Bozbaşla plov da başda olardı.* H.Sarabski.

13. *sif.* Başqalarına nisbətən daha mühüm, ən əsas, ən böyük, başlıca. *Şəhərin baş küçələri. Ölkənin baş şəhəri. Baş məsələ. İdarələr şəhərin baş binalarında yerləşmişdir. – Nümayişçilər şəhərin baş küçəsinə doğru ağır-ağır irəliləyirdi.* A.Şaiq. // Ali, ən yüksək. *Baş idarələr. Baş məclis. Baş Mətbuat*

*Müdirliyi. Baş komandanlıq. – Əsgərin qəlbindən qopdu bu cavab; Dedi: "Kremldir bizim baş ştab".* S.Rüstəm.

14. *sif. dan.* Əla, ən yüksək, ən yaxşı, ən seçmə. *Baş mal. – Nənəqız oxumamış olsa da, bilirdi ki, təhsil işində beş ən baş qiymətdir*. S.Rəhimov.

15. Sözün əvvəlinə rəqəm gətirməklə işlənir – dəfə, kərə mənasında. [Öküzlər] *bir baş da gedib qayıtdılar*. S.Rəhimov. [Mirzə Hüseyn] *çox əsəbi idi, otağı bir-iki baş dolanıb, sonra Əsgərə lap yaxın oturdu*. S.Rəhman. // İki nöqtə arasında məsafə, yol. *Hər iki başı piyada getdik. Biletin bir başı neçəyədir?*

16. *dan*. Əsas, kök, səbəb, səbəbkar. *Bütün işlərin başı odur. – Əgərçi qaşlarındır fitnə başı: Hərami gözlərin əyyarə bənzər*. Nəsimi. *Arvadın işini Allah da bilməz. Genə işlərin başı sənsən*. N.Vəzirov.

17. *köhn*. Keçmişdə kəndlərdə işlənən şərti su ölçüsü vahidi. [Tubu:] *..Getdin ağadan üç günlüyə yarım baş su istədin, onu sənə pulsuz vermədi?* Ə.Haqverdiyev.

◊ **Baş açıb ağlamaq** *köhn.* – qarğış etmək, nifrin etmək. **Baş açmaq** – 1) başa düşmək, anlamaq, düşünmək. *Vallah, mən sənin sözlərindən baş açmıram*. C.Məmmədquluzadə. *Biz də .. bisavad adamıq, kitabdan nə baş açacaq idik*. Ə.Haqverdiyev. *..Vəli yeni hadisələrdən baş açmırdı.* Mir Cəlal; 2) sünbül açmaq, sünbüllənmək. *Taxıllar baş açdı*; 3) oxşamaq, ölü üstündə ağlamaq. **Baş açmamaq** – başa düşməmək, anlamamaq, qana bilməmək. *Vallah, xeyir ola, baş açmıram, toydur, ehsandır, nədir?* S.Rəhimov. *Naçalnik bu işdən bir o qədər baş açmadı.* M.Hüseyn. **Baş ağartmaq** *məc.* – bir işdə çox çalışıb təcrübə qazanmaq. *Mən bu işdə baş ağartmışam*. **Baş ağrıtmaq** – zəhmət vermək, əziyyət vermək, incitmək, vaxtını almaq, mane olmaq. [Cahan:] *Boş yerə başını ağrıdıb, mənim də vaxtımı əlimdən alma!..* Ə.Haqverdiyev. **Baş alıb getmək (qaçmaq)** – b a x **baş almaq** 2-ci mənada. *Gecə-gündüz gözüm, könlüm; Qan-yaş tökər yar əlindən; Baş alıb gedim nə yana; Bu iki xunxar əlindən.* Q.Zakir. **Baş alıb gəlmək** – axışıb gəlmək. *Qoyunquzunun mələşməsi, atların kişnəməsi, uşaqların ağlaşması bir-birinə qarışmışdı. El baş alıb gəlirdi*. Çəmənzəminli. **Baş almaq** – 1) uzun-uzadı danışmaq, uzunçuluq eləmək; 2) qarşısına gələn istiqamətə doğru getmək, baş götürüb getmək, qaçmaq. *Ağa evdən baş alıb, dincəlmək üçün şəhərə yola düşdü*. S.Rəhimov. **Baş aparmaq** – 1) üz tutmaq, yönəlmək, getmək, əl atmaq, məşğul olmaq. *Baş aparıb hər biri bir sənətə!* M.Ə.Sabir. *O öz dəstəsi ilə bacardığı hər bir işə baş aparmaq imkanı verirdi*. Ə.Əbülhəsən; 2) zəhlə tökmək, lovğa-lovğa danışmaq, artıq-əskik danışmaq, danışığını bilməmək. *Az danış, başımı aparma, kişi, sən sərsərisən.* M.P.Vaqif. *Baş aparma, Fərhad, adam kimi danış.* N.Vəzirov. [Mehtər] *xülasə çox baş apardı.* Ə.Haqverdiyev; 3) qaçmaq, tabe olmamaq, baş götürüb qaçmaq. *Bu atın bir eybi var ki, baş aparıb gedir. – Baş aparan "atları" səyirdərək dördnala; Qaçışır, gülüşürlər hey şeypur çala-çala.* Ə.Cəmil; 4) dəng etmək, beyninə təsir etmək, üzmək. *Zurnanın səsi başımızı apardı.* **Baş atmaq** – 1) sözünün dal-qabağını gözləməmək, yekə danışmaq, həddini keçmək; 2) nişanəni vurmamaq, onu yuxarısından vurmaq, düz vurmamaq (hədəfi). *Tüfəng baş atır*. **Baş bağlamaq** – 1) dən əmələ gəlmək (bitkilərdə). *Günəbaxan hələ baş bağlamamışdır*; 2) *məc.* bağlanmaq, məhəbbət yetirmək, uymaq. *Oğlan qıza baş bağladı*. **Baş çapmaq** – b a x **baş vurmaq** 8-ci mənada. **Baş çəkmək** – hal soruşmaq, birinin halını bilmək üçün onun yanına getmək; dəymək, yoxlamaq, yoluxmaq. *Xəstəyə baş çəkmək. – Bir baş çəkin dərdməndin halinə; Ərzə yazsın, qələm alsın əlinə.* M.V.Vidadi. *Rəsul durub ayağa əl-üzünü yuyub dedi: gedim bir qonaqlara baş çəkim. "*Aşıq Qərib*".* [Xan:] *Ələkbərə yazmışam ki, arabanı sazlasın; hazır olan kimi .. kəndə baş çəkəcəyəm.* C.Məmmədquluzadə. **Baş çıxarmaq** – 1) anlamaq, başa düşmək, qanmaq. *Mən sənin işindən heç baş çıxara bilmirəm.* – [Məhərrəm:] *Məgər sənin işindən mən baş çıxardıram?* N.Vəzirov; 2) b a x **baş açmaq** 2-ci mənada. *Baş çıxarmış şükufələr seyr*

*edər; Yaşılına, o alına, sevdiyim.* M.V.Vidadi. **Baş dolandırmaq** – 1) birtəhər keçinmək, yaşamaq, güzəran etmək; 2) ciddi bir iş ilə məşğul olmayaraq, vaxtını boş keçirmək, orada-burada yubanmaq. *Gəl işini gör, baş dolandırma.* **Baş eləmək** – yetişmək, ağarışmaq, irinləmək (çiban, yara haqqında). **Baş endirmək** – təzim etmək, baş əyib salam vermək. *Xanı görcək yazıq baş endirdi; Gör onu xan nə gunə dindirdi.* S.Ə.Şirvani. *Tülkü görcək yavaş-yavaş gəldi; Endirib baş ədəblə çömbəldi.* M.Ə.Sabir. *Xidmətçi daxil olub baş endirdi.* M.S.Ordubadi. **Baş əymək** – 1) ehtiram etmək, təzim etmək, salam vermək. [Şahmar bəy:] *Səfdərqulu, atan otağa daxil olanda, ya ki küçədə rast gələndə lazım bilirsən* ayağa durub baş əymək, yoxsa lazım bilmirsən? N.Vəzirov. *..Oturanlar hamısı baş əyib, dilucu salam verdilər.* Mir Cəlal; 2) tabe olmaq, itaət etmək, alçalmaq. *Arvadının mərdliyini görən kişi ömründə düşmənə baş əyməz.* M.Hüseyn. **Baş gəzdirmək** – b a x **baş dolandırmaq**. **Baş girləmək** – b a x **baş dolandırmaq**. **Baş göstərmək** – zahir olmaq, meydana çıxmaq, görünmək. **Baş götürüb qaçmaq (getmək**) – b a x **baş alıb getmək.** [Salman bəy:] *Bu ev cin, şeytan ocağıdı*(r), *baş götürüb gedənin canı qurtarı*(r). N.Vəzirov. [Şair] *baş götürüb getdiyi uzaqlardan geri qayıtdı.* Ə.Məmmədxanlı. **Baş işlətmək** – fikirləşmək. **Baş kəsmək** *məc.* – çox baha satmaq, insafsızlıq eləmək. **Baş qaçırmaq** – boyun qaçırmaq, boynuna götürməmək, yaxa qurtarmaq, bəhanə gətirmək. *Vədəsindən baş qaçırmaq. İşdən baş qaçırmaq.* – [Namaz:] *Xeyr, qoy görüm, Vəli, ayıb deyil baş qaçırırsan?* M.F.Axundzadə. **Baş qaldırmaq** – 1) üsyan etmək, qiyam etmək; qalxışmaq, hərəkətə gəlmək, dirçəlmək. [İngiltərə və çar hökuməti] *hər nə cür olur olsun, İranda baş qaldıran inqilab hərəkatını boğmalı idilər.* M.S.Ordubadi; // üzə durmaq, itaətsizlik göstərmək, tabe olmamaq; 2) bitmək, cücərmək, başları görünmək. *Buludlar parçalanır, torpaq buğlanır, otlar baş qaldırır, quşlar civildəşməyə başlayırdı.* M.İbrahimov; 3) oyanmaq, özünü hiss etdirmək. *Ürəyində anlaşılmaz bir əndişə baş qaldırdı.* M.İbrahimov. **Baş qarışdırmaq** – b a x **başını qarışdırmaq. Baş qarışmaq** – iş çox olmaq, vaxt olmamaq. *Burada yenə Mişa qayğıkeşlik göstərdi: – Çıxart çörək yeyək! – dedi,– sonra baş qarışar.* Ə.Əbülhəsən. **Baş qatmaq** b a x **baş qoşmaq** 2-ci mənada. **Baş qaşımağa vaxtı olmamaq** – işi həddindən artıq olmaq, qətiyyən boş vaxtı olmamaq. *İşim çoxdur, baş qaşımağa vaxtım yoxdur.* **Baş qırxmaq** (*məc.*) – fırıldaq işlətmək, aldatmaq, tovlayıb almaq. *Dağılıb çöllərə açdı hərə bir növ kələk; Qırxdı xalqın başını hər biri misli-dəllək.* S.Ə.Şirvani. **Baş qoşmaq** – 1) fikir vermək, əhəmiyyət vermək, maraqlanmaq. [Səlim] *bir daha qocaya baş qoşmayıb, oxuduğu romanı vərəqlədi..* M.Hüseyn. *A kişi, .. buna baş qoşma, ağzına ağız verib özündən çıxarma.* S.Rəhimov; 2) məşğul olmaq, bir işə girişmək, özünü soxmaq, müdaxilə etmək, qarışmaq. *Katib tənglənib çıxardı, baş qoşmazdı.* Mir Cəlal; 3) sataşmaq, öcəşmək. *Uşaqlar, qoy getsin, baş qoşmayın. Ona baş qoşma, görürsən ki, anlamır.* **Baş qoymaq** – canını fəda etmək, canından keçmək. *Vətən yolunda baş qoymaq.* **Baş məqalə** – qəzetdə, jurnalda ən birinci yerdə çap olunan əsas redaksiya məqaləsi. *Arsen qəzetin baş məqaləsində kəndə dair nə yazsaydı, Məşədibəylə bir yerdə müzakirə edərdi*. M.Hüseyn. **Baş salamatlığı** – 1) b a x **başsağlığı***;* 2) dinclik, rahatlıq, salamatlıq, xətərsizlik. **Baş sındırmaq** – çətin bir məsələnin üzərində çox düşünmək, çox fikirləşib həll etməyə çalışmaq. *Professor Belokurov beş ildir bunun üstündə baş sındırır, heç bir yana çıxa bilmir.* C.Cabbarlı. *Hər daşın oxunması üzərində baş sındırmalara nə ehtiyac vardı?* Mir Cəlal. **Baş soxmaq** – girmək, soxulmaq. **Baş tapmaq** – anlamaq, qanmaq, başa düşmək, dərk etmək. *Onun işindən baş tapmaq olmur.* – [Süsən:] *Hə, bağışlayınız, baş tapmadım.* M.S.Ordubadi. *Mirzə Kamal bəy başını qaşıyıb: – Mən baş tapmadım! – dedi.* S.Rəhimov. **Baş təpmək** – b a x **baş soxmaq.** [Əhməd:] *Bir xaraba qalmayıb ki, mən ora baş təpməyəm.* N.Vəzirov. *Bir az fikir-*

*ləşdim; gözlərimi dörd tərəfə gəzdirdim: dərədə yatmışdım, bircə lağımdan başqa baş təpəcək yer yox idi.* Çəmənzəminli. **Baş tutmaq** – 1) əmələ gəlmək, hasil olmaq, nəticə vermək. [Ağa Mərdan:] *Əgər bu iş mən deyən kimi baş tutsa, Təbrizdə mənim şöhrətim ərşi-fələkə çıxacaq!* M.F.Axundzadə. *Ancaq üç nəfər adam gəlmişdi. İclas baş tutmadı.* Mir Cəlal. [Xəlil:] [Şahmar], *görünür sövdən baş tutmayıb. Çox pərtsən, aşna.* M.Hüseyn; 2) dən bağlamaq. *Bu taxıl hələ baş tutmayıbdır;* 3) taxılı xəlbirləyib zibilini təmizləmək. *Taxılı baş tutub, anbara yığdılar;* 4) bir şeyin oğurluq olduğunu meydana çıxarmaq, oğurluq malı tutmaq. **Baş tutmamaq** – əmələ gəlməmək, hasil olmamaq, müvəffəqiyyətsizliyə uğramaq, nəticə verməmək. *Kələyin baş tutmamasından şad və xürrəm halda Mahmud bayıra çıxıb arvadının, çarşabı qoltuğuna vurub, yeznəsi ilə getməsini müşahidə edir.* B.Talıblı. **Baş üstə!** – hazıram, yaxşı, razıyam mənasında işlənən ifadə. [Əhməd:] *Baş üstə, Cahangir bəy, al bu pulları hər nədir..* N.Vəzirov. *Dedim: – Baş üstə. Və həkim soruşsa ki, niyə mənim davamı içmədin, mən ona nə cavab verim?* C.Məmmədquluzadə. [Tələbə:] *Baş üstə, müəllim, sabah birgünlük xatiratımı yazıb gətirəcəyəm.* Qantəmir. **Baş vermək** – 1) əmələ gəlmək, meydana gəlmək, vaqe olmaq, sadir olmaq, ortaya çıxmaq, olmaq. *Hadisə baş verdi. – Baş verir səndən öylə bir hərəkət; Ki, bütün xalq edir həmən nifrət.* H.Cavid. [Ağa Həsən:] *Xanım, niyə məni bəndəliyə qəbul etmirsən, məndən nə xata baş veribdir?* M.F.Axundzadə. [Konsul:] *Son günlər bu cürə hadisələr çox tez-tez baş verir.* M.S.Ordubadi; 2) başlamaq. *Bulud zahir olunca, yağış baş verdi. Birdən külək baş verdi;* 3) cücərmək, bitmək, başı görünmək. *Əcəl macal verə, gün gəlib ötə; Baş verib bənövşə, yasəmən bitə.* Aşıq İsmayıl. *Lalələr kim baş verib xaki-məzarımdan çıxar; Firqətindən çəkdi kim, sinəmdə həsrət dağıdır.* S.Ə.Şirvani. **Baş vurmaq** – 1) güllə atdıqda hədəfdən yuxarıya vurmaq. *Tüfəng baş vurur;* 2) mübaliğə etmək, yekə-yekə danışmaq, lovğalanmaq; 3) b a x **baş çəkmək**. [Pası] *Cəbini yəhərli atının qucağına alaraq, kənddə evlərinə baş vurmağa gəlmişdi.* S.Rəhimov. *Nuruoğlu səhər tezdən işə gedərkən dəftərxanaya baş vurub, hesabdarı yanına çağırtdırdı.* M.Hüseyn; 4) suya batıb çıxmaq, dalmaq. *Üzgüçü baş vurub, sudan üzüyü çıxartdı. – Şöhrətimiz bu ellərə yayılsın; Ey baş vurub göldə çimən durnalar.* S.Rüstəm. *Gen qoynunda Xəzərin; Sulara baş vuraraq; Qayalar üzərində qağayılar uçur, bax!..* Ə.Cəmil; 5) yırğalanmaq (gəmi haqqında); 6) həmlə etmək, hücum etmək. *Qəhrəman baş vurdu bir də; Üç düşmən tankını .. sovurdu göyə.* R.Rza; 7) baş endirmək, təzim etmək. *Molla Həmid baş vurub, çadırdan çıxır.* M.F.Axundzadə. [Hacı Fərəc:] *İndiyə kimi mənə məhəl qoymayan adamlar, məni görəndə ikiqat olub baş vuracaqlar.* N.Vəzirov; 8) *din.* keçmişdə: Məhərrəm ayında aşura günü qatı mövhumatçıların baş çapmaq, baş yarmaq ayini. **Baş yarmaq** – 1) b a x **baş vurmaq** 8-ci mənada*;* 2) zərər vermək, ziyan vermək. *Artıq tamah baş yarar.* (Ata. sözü). [Namaz:] *Artıq tikə məgər baş yarar?* M.F.Axundzadə. **Baş yoldaşı** – arvad, ər, həyat yoldaşı. *Baş yoldaşı gör nədir ha! – deyə, bir qadın əsnə*(*di*).. S.Rəhimov. **Baş yormaq** *məc.* – *çox düşünmək, çox fikirləşmək.* Bunun üçün baş yormağa dəyməz. **Baş(dan) beyindən olmaq** – dəng olmaq, çox eşitməkdən, səs-küydən qulaqları batmaq. **Başa aparmaq** – 1) b a x **baş dolandırmaq** 1-ci mənada. *Həmişə nalə və əfğan ilə ruzgarlarını başa aparardar və bir kəs onların dadına yetişmir..* M.F.Axundzadə; 2) sürmək, keçirmək. *Bir kənar guşəyə çəkilib, istirahət ilə ömür başa aparır.* Ə.Haqverdiyev. **Başa batmaq** – ağıl kəsmək, inanıla bilmək, həqiqətə yaxın olmaq. **Başa bəla gətirmək (açmaq, olmaq)** – bədbəxtliyə, əziyyətə, narahatlığa, qayğıya səbəb olmaq; əngəl olmaq. *Bu dünyada üç şey başa bəladı; Yaman övlad, yaman arvad, yaman at.* Aşıq Ələsgər. [Yusif:] *Mən bilirdim ki, ucuqdan çıxmış qız axırda bizim başımıza bəla gətirəcəkdir.* S.S.Axundov. [Kazım:] *Axund, bilirsən ki, dilə düşməkdən qorxuram. Bu zamanda dilə düşmək başa*

*bəla açar.* Çəmənzəminli. **Başa bəla olmaq** – zərərli, əziyyətli, dözülməz, yaxud arzuedilməz adam, şey haqqında. **Başa çatdırmaq** – axıra çatdırmaq, qurtarmaq, tamamlamaq. **Başa çatmaq** – axıra yetmək, nəhayətə varmaq, tamamlanmaq. *Mühəndis Haqverdizadənin bütün hazırlıq işləri başa çatmışdı.* S.Rəhimov; // həyata keçmək. *Neftçilər çalışırlar; dörd ildə başa çatsın; Böyük beşillik plan.* M.Seyidzadə. **Başa çıxarmaq** *məc.* – həddindən artıq üz verib, ərköyün böyüdüb qudurtmaq, ayaqlandırmaq. *Sən bu uşağı lap başımıza çıxartdın.* **Başa çıxmaq** – 1) ərköyünlükdən qudurmaq, həddini aşmaq, böyük-kiçik bilməmək, ayaqlanmaq. *Sənə dinmədikcə lap başa çıxırsan;* 2) işi axıra qədər görmək, tamamlamaq, qurtarmaq. *Əlimdəki işi başa çıxdım. Kitabı oxuyub başa çıxdım*; 3) birincilik qazanmaq, üstün gəlmək, qalib gəlmək. *Ötüşdə başa çıxmayanın başı torpağa düşər.* S.Rəhimov. **Başa düşmək** – anlamaq, düşünmək, qanmaq. *Gərək əhli-Təbriz kimi sahibi-mərifət .. olmaq ki, bu mətalibi başa düşmək.* M.F.Axundzadə. [Səfdərqulu:] *Vallah, başa düşə bilmirəm, məndən nə istəyirsiniz?* N.Vəzirov. *Kərbəlayı Mirzəlinin sözünü əvvəl dəfə biz heç başa düşmədik.* C.Məmmədquluzadə. **Başa əngəl olmaq** – b a x **başa bəla olmaq. Başa gəlmək** – 1) yetmək, tamam olmaq, əmələ gəlmək, hasil olmaq. *Nahar hələ başa gəlmədi? – Köçaxır kəndi kövşənində Kür qırağına çəkilən bənd tikilib başa gəldi.* Mir Cəlal; // həyata keçmək. *Başa gəlir elədiyin niyyətlər; Gər sidq ilə doğru qeyrət eylərsən.* M.V.Vidadi; 2) b a x **başına gəlmək**. **Başa gətirmək** – qayırmaq, düzəltmək, hazırlamaq. [Usta Ağabalanın] *neçə həftəyə başa gətirdiyi başmaqlar məsciddə əl-ələ gəzirdi.* Çəmənzəminli. **Başa qaxmaq** – etdiyi yaxşılığı xatırladaraq, üzünə deyərək utandırmaq, üzünə vurmaq, başa çaxmaq, minnət qoymaq. *Maro dodağını çeynəyə-çeynəyə: – Yastı-yastı danışıb, az başıma qax də! – dedi.* S.Rəhimov. **Başa mindirmək –** b a x **başa çıxarmaq**. **Başa salmaq** – anlatmaq, qandırmaq, izah etmək. *Bəzi kəndlərdə kimin ləhinə, kimin əleyhinə, nəyə qarşı əl qaldırmağı başa salmaq özü böyük hünər idi.* Mir Cəlal. **Başa vermək** – 1) axıra yetirmək, sona çatdırmaq; 2) yola aparmaq, yola vermək, rəftar etmək. **Başa vurmaq** – 1) axıra çatdırmaq, bitirmək, tamamlamaq, tamama yetirmək. *Zeynal etiraz edib: – Oyunu başa vurmalısan! – deyə onu yerində oturtdu.* A.Şaiq. *Vurdu başa öz ömrünü min qəmdə Nizami; "Şerim qalacaq, söylədi, ölsəm də!" Nizami.* S.Rüstəm; 2) axıra kimi gəzmək, bir yeri diqqətlə axtarıb araşdırmaq. [Qədim dayı] *bazarı başa vurub, bir neçə fətir çörək aldı və qoltuğuna vurub, yolun ağzına düşdü.* S.Rəhimov; 3) b a x **başa qaxmaq**. **Başa yetişmək (yetmək)** – b a x **başa çatmaq.** *Yetişdi başa ömrüm, olmadı məqsudi-dil hasil.* Q.Zakir. **Başda dolandırmaq (gəzdirmək)** – aldatmaq, yalan vədlərlə aldatmaq. [Birisi:] *Ay muzdur, sən sənin Allahın, de görüm, bizi niyə başda gəzdirirsən?* Ə.Əbülhəsən. **Başdan aşmaq (daşmaq)** – bol olmaq, həddindən artıq çox olmaq. *Mağazalarda mal başdan aşır. Heç vaxtım yoxdur, iş başımda aşmışdır.* **Başdan atmaq** – rədd etmək, qəbul etməmək, boyun qaçırmaq. **Başdan çıxarmaq** – aldatmaq, azdırmaq, tovlamaq, pis yola sövq etmək. *Hansı müflislər sizi başdan çıxardıblar?* C.Məmmədquluzadə. **Başdan çıxmaq** – çaşmaq, səhv etmək, aldanmaq, yanılmaq. *Mən başdan çıxdım, nahaq yerə onun sözlərinə qulaq asdım!* **Başı ayazımaq** – b a x **başı ayılmaq** 1-ci mənada. [Vaqif:] *Xülasə gecə-gündüz bu xanların bir-biri ilə höcəşməsindən heç başımız ayazımır.* Çəmənzəminli. **Başdan eləmək (etmək)** – rədd etmək, başdan ötürmək, özündən uzaqlaşdırmaq, canını qurtarmaq. *Xanpəri qardaşı oğlunun suallarına ağızucu cavab verib, onu başdan etməyə çalışdı.* Ə.Vəliyev. *Fərzəlini başdan etmək üçün Kərbəlayı Hətəm xanla Hacı Səfiqulu kimi mötəbər adamların şahidliyini düzəltmək pis olmazdı.* S.Rəhimov. **Başdan getmək** – aldanmaq, yanılmaq, səhv etmək. **Başdan keçmək** – candan keçmək, özünü fəda etmək. *Başdan keçibən eşqdə cövlan gərək olsun; Meydani-məhəbbətdi bu, ey dil, ciyər istər.* S.Ə.Şirvani. **Başdan olmaq**

(mənfi mənada) – 1) tamam olmaq, qurtarmaq, bitmək; 2) rədd olmaq, əl götürmək, çıxıb getmək; 3) səs-küydən dəng olmaq, təngə gəlmək, darıxmaq. *Bu hay-küy nədir, lap başdan olduq.* **Başdan rədd eləmək** – b a x **başdan eləmək (etmək)**. [Səfər bəy:] *Mirzə Turab, axund Molla Abuş buraya gəlir.. Ancaq sən Allah, tez başdan rədd elə getsin ki, nəşəmiz dağılmasın.* B.Talıblı. **Başdan sovurmaq** – diqqətsizlik etmək, tələsmək, bir işi keyfiyyətsiz, tələsik görmək, başdansovma etmək. **Baş-göz eləmək** – evləndirmək. [Dursun:] *Axı bizim əhdimiz vardı, biz sizi baş-göz eləmək istəyirdik.* Ə.Əbülhəsən. **Başı (bədəninə, çiyninə) ağırlıq etmək** – hədə mənasında işlənən ifadədir. **Başı açıq qalmaq** *məc.* – himayəsiz, yiyəsiz, kimsəsiz qalmaq. **Başı açılmaq** – 1) b a x **başı ayılmaq** 1-ci mənada. *İşdən heç başım açılmır;* 2) külli miqdarda axın ilə gəlməyə başlamaq. *Sürünün başı açıldı. – Bir neçə dəqiqədən sonra dəstənin başı açıldı.* M.S.Ordubadi; 3) başlanmaq. [Əbdürrəhman bəy:] *Mətləbin başı açıldı, amma çox zülmnən.* N.Vəzirov. **Başı aşağı etmək** – xəcalətli etmək, xəcalət çəkməsinə, utanmasına səbəb olmaq. *Yalnız teatr sevgisi onları dost-düşmən yanında xar eyləyir, ata-ana yanında başı aşağı edirdi.* S.Rəhman. **Başı aşağı olmaq** – xəcalətli olmaq, etdiyi bir iş üçün xəcalət çəkmək, utanmaq. [Pirverdi bəy:] *Sizə məlumdur ki, mən on yeddi ildi ki, ixlas ilə qulluq eləyirəm. Və bir dəfə olmayıb ki, mən dövlət yanında başı aşağı olum.* C.Məmmədquluzadə. **Başı ayılmaq** – 1) işdən asudə olmaq, rahat olmaq, xilas olmaq. *İşdən heç başı ayılmayır.* – [Püstə dedi:] *Qoy qonşumuz*(*un*) *yasından başım ayılsın, mən bir qazan qaynadaram ki..* H.Sarabski; 2) sərxoşluğu keçmək, ayılmaq. **Başı aynımaq** – b a x **başı ayılmaq** 1-ci mənada. *Qoy bir başım aynısın.* **Başı bağlanmaq** – satılması, işlənməsi, istifadə edilməsi məhkəmə və s. tərəfindən qadağan olunmaq. **Başı batsın, başın batsın** – qarğış. *Sənin başın batsın! Kaş sən heç gəlib bunu görməyəydin, – deyə Mahmud əmi Əsədin üstə çığırıb və özü də qaçanlara qoşulub, kəndə sarı yönəldi.* B.Talıblı. **Başı bənd olmaq** – 1) evlənmək, evli olmaq, ailə sahibi olmaq; 2) b a x **başı qarışmaq**. **Başı böyümək** – b a x **başı şişmək**. *Qəm tünlük, mən yalqız, yüz yana çəkər; Zakirəm, böyüyüb başım, ağlaram.* Q.Zakir. **Başı çıxmaq** – tanış olmaq, aşna olmaq, bələd olmaq, bilmək, başa düşmək, anlamaq. *İnsan gərək qorxaq olmasın, insanda gərək cürət ola, belə-belə işlərdən başı çıxa.* B.Talıblı. **Başı çıxmamaq** – bələd olmamaq, tanış olmamaq, bilməmək, başa düşməmək, bacarmamaq. *Tükəzban xalanın siyasətdən çox da başı çıxmazdı.* B.Talıblı. [Mədəd:] *Haqq-hesabdan nə sənin başın çıxır, nə də mənim.* İ.Əfəndiyev. **Başı daşa dəymək** – fəlakətə, uğursuzluğa rast gəlib peşman olmaq, acı təcrübə görmək. *Başı daşa dəyməyincə, ağlı başına gəlməz.* (Ata. sözü). **Başı ətlənmək** – varlanmaq, pullanmaq. **Başı gərm olmaq** – başı qızışmaq. *Nə deyim, ay qardaş, başı gərm olsa, getdi gecə yarısına.* Mir Cəlal. **Başı gicişmək** *məc.* – heç bir səbəb olmadan özü üçün xətərli iş tutmaq, əcəli çatmaq. **Başı xarab olmaq** – sarsaqlamaq, gicləşmək, xərifləmək, başına hava gəlmək, ağlını azdırmaq. [Mirzə Cavad:] *Bala, sənin başın xarab olubdur.* Ə.Haqverdiyev. **Başı xoş olmaq** – halı, əhvalı yaxşı olmaq. **Başı ilə cavab vermək** – bütün məsuliyyəti boynuna götürmək, zamin olmaq. **Başı qarışmaq** – bir şeylə məşğul olmaq. *Bu gün mənim başım qarışıqdır. – Hacı Nəsirin başı yas yerinə gələn adamlara qarışdığından, oğlundan xəbərsiz idi.* S.S.Axundov. *Kişinin .. başı qarışar, uşaq isə onu gözləyər, mollaxanasının vaxtı keçərdi.* H.Sarabski. **Başı qızışmaq** – 1) çox məşğul olmaq, bir işlə ciddi məşğul olmaq, hər şeyi unutmaq. *Səhərdən axşama kimi işlə başı qızışmış, yemək belə yadına düşmür;* 2) hirslənmək, əsəbiləşmək, özündən çıxmaq. *Elə başı qızışmışdı ki, heç kəsi tanımırdı.* **Başı şişmək** – işin çoxluğundan, dərddən, yaxud başqa bir səbəbdən nə edəcəyini bilməmək, başını itirmək. *..İndi yay fəslidir, indi belə-belə məqalələrin vaxtı deyil; istidən adamın başı şişir.* C.Məmmədquluzadə. **Başı ucalmaq, başı uca olmaq** – yüksəlmək, böyümək, artmaq, hörmət,

nüfuz qazanmaq (*yaxşı bir iş görmək nəticəsində*). *Qəhrəman istəyirdi ki, .. Möhsün bəyin üzü ağ, alnı açıq, başı uca olsun.* S.Rəhimov. **Başı üstündə durmamaq** – bərk kefli adam haqqında. **Başı üstünü kəsmək** – 1) yanından ayrılmamaq, yanını kəsdirib durmaq, qulluq etmək. *Bütün günü həkim xəstənin başı üstünü kəsmişdi;* 2) *məc.* qısnamaq, tələsdirmək, sıxışdırmaq. **Başı yastığa enmək** – naxoşlamaq, xəstələnmək. **Başıma (başına) dəysin** – çox pis, keyfiyyətsiz, dəyərsiz iş haqqında. *Dedi ki, belə iş mənim başıma dəysin.* "Kirpi" **Başına yeritmək** – b a x **beyninə yeritmək (salmaq)** ("**beyin**"də). **Başın(ız) sağ olsun!** – təziyə və təsəlli ifadəsidir. *Ana, başın sağ olsun, oğlun mənimlə gəlirdi, yolda onu həramilər soyub öldürdülər.* "Aşıq Qərib". *Qorxuram tən edib deyələr sənə; Zakirin ölübdür, başın sağ olsun!* Q.Zakir. **Başın(ız) üçün!** – and yerində işlənir. **Başın(ız)a dolanım (dönüm, dönərəm)** – 1) yalvarış, nəvazişlə xahiş bildirən ifadə. *Dolanım başına, ey sərvqamət; Qonaq kafir olsa, lazımdır hörmət.* Q.Zakir. *A başına dönüm, sən mənim gözümə bir ağıllı adam gəlirsən.* Ə.Haqverdiyev. *Nina bacı, mən ölüm mənə bənd olma, belə başına dönərəm.* M.S.Ordubadi. [Cavad:] *Ay Mirzə! Başına dolanım, atadan, babadanqalma bir parça yerim vardı. ..İndi Səfər ağa gəlib yerimi tutub.* B.Talıblı. **Başına ağıl qoymaq** – yaxşı məsləhət vermək, pis əməldən daşındırmaq. **Başına almaq, aləmi başına almaq** – b a x **başına götürmək.** *Bəs necə oldu ki, Cənnət xanım evdə ola-ola Verdiyevin küykələyi aləmi başına alır?* Mir Cəlal. **Başına and olsun!** – b a x **başın(ız) üçün. Başına at təpmək** – dəli olmaq, sarsaqlamaq, axmaqlamaq, axmaq danışmaq (ya iş görmək). **Başına buraxmaq** – başlı-başına buraxmaq, öz ixtiyarına qoymaq, sərbəst buraxmaq, baxmamaq, nəzarətsiz qoymaq, daha maraqlanmamaq. **Başına cəm etmək** – b a x **başına toplamaq**. *Qışın uzun gecələrində nənəm kürsüyə od töküb qızdırandan sonra, bizi başına cəm edib, qaravəlli və nağıl danışıb, hərdən bir mənim tərcümeyi-halımdan söhbət elərdi.* H.Sarabski. **Başına çarə qılmaq (görmək)** – tədbir aramaq, çıxış yolu tapmaq. *Dəli könül, gör başına bir çarə; Gözü sərxoş, zülfü ilan gəlmişəm.* Q.Zakir. **Başına çəkmək** *məc.* – hamısını birdən içmək, tamamilə içmək, acgözlüklə içmək. *Kişi parçı bir nəfəsə başına çəkdi.* İ.Əfəndiyev. **Başına daş düşmək** – 1) gözü götürməmək, paxıllıq etmək, həsəd aparmaq. [Təkəzban:] *Niyə əlinizi qaldırmırsınız? Bir dənə arvad adı gələndə başınıza daş düşür, qoymursuz seçilməyə.* B.Talıblı; 2) fəlakətə uğramaq, bədbəxtlik üz vermək. **Başına daş salmaq** – boş yerə tələf etmək, puç etmək, itirmək, sərf etmək, korlamaq (*pulu, malı və s.-ni*). *Kitabın başına daş saldın.* **Başına dolanmaq** – həddindən artıq əzizləmək, nəvaziş etmək, qayğısını çəkmək. *Ata və ana gecə və gündüz Nurəddinin başına dolanırdılar.* S.S.Axundov. **Başına düşmək** – yadına düşmək, ürəyi istəmək, xatiri istəmək. *Çoxdandır səni görməmişəm, başıma düşdün, gəldim səninlə bir az dərdləşək.* H.Sarabski. **Başına gəlmək** – birinə hadisə üz vermək, bir hadisəni şəxsən görmək, təcrübə etmək, görüb keçirmək; məruz qalmaq, rast gəlmək. *Gülpərinin qorxduğu başına gəldi. Belə ki, ağır yüklü fayton əyri-üyrü və eniş-yoxuş yollara çatdıqda, bir döngədə aşıb, oxu və çarxı sındı.* S.S.Axundov. **Başına girməmək** – başa düşə bilməmək, anlaya bilməmək. **Başına götürmək** – 1) hər tərəfə dolmaq, yayılmaq. *Bankanın ağzı açılanda ətir qoxusu evi başına götürdü.* Ə.Haqverdiyev. *Ayının bağırtısı meşəni başına götürmüşdü.* S.S.Axundov; 2) bərkdən danışaraq başqalarına aman verməmək. **Başına hava gəlmək** – ağlı başından oynamaq, dəli olmaq. *Əmir, Teymur oğlu Miranşahın başına hava gəldiyi üçün ona tapşırılan vilayətləri alıb, oğlu şahzadə Ömərə verdi.* A.Bakıxanov. [Cavahir xanım:] *Atam bu əhvalatı eşidən kimi başına hava gəlib.* N.Vəzirov. **Başına iş gəlmək** – bəlaya uğramaq, müsibət üz vermək, qəza üz vermək, hadisə üz vermək, çətin və çıxılmaz bir vəziyyətə düşmək. *Usta Ağabalanın başının yarısı təraş olmamışdı; birdən Kərbəlayı Qulu geri çəkilib dedi: – Usta, axı başıma bir iş gəlib.* Çəmən-

zəminli. **Başına iş gətirmək** – əngələ salmaq, pislik eləmək, bəlaya, fəlakətə uğratmaq. [Səkinə xanım:] *Gülsəba, heç bilirsən ki, mənim bu bihəya qardaşım arvadı başıma nə iş gətiribdir?* M.F.Axundzadə. [Nəcəf bəy:] *Süleyman! Axırı bu iş qalmışdı ki, mənim başıma gətirdin.* Ə.Haqverdiyev. **Başına it oyunu açmaq, başına itin suyunu tökmək** – biabır etmək, təhqir edəcək dərəcədə danlamaq. *Qumru .. söz verdi ki, gedib evində muzdurun başına itin suyunu töksün.* Ə.Əbülhəsən. **Başına kələk açmaq** – ağır bir vəziyyətə salmaq. **Başına kül (olsun)!** – qarğış ifadəsidir. **Başına qalmaq** – 1) həddindən artıq olmaq, bol olmaq, satılmamaq, müştərisi olmamaq. *Bazarda üzüm başına qalıbdır. – Yatar mühaciri-islam ac, qar üstündə; Qalar pilov başına mətbəxində əyanın.* M.Möcüz; 2) sahibsiz qalmaq, baxımsız qalmaq, nəzarətsiz qalmaq. **Başına qəza gəlmək** – b a x **başına iş gəlmək. Başına qiyamət qopmaq** – müsibət üz vermək. *Görməsəm başıma qopar qiyamət; Sərvi-qədin məddi-nəzərdir mənə.* Q.Zakir. **Başına mindirmək** – b a x **başa çıxarmaq**. [Əsgər:] *..Allah mənim atamı öldürsün ki, səni də mənim başıma mindirdi.* N.Vəzirov. **Başına oyun açmaq** – b a x **başına kələk açmaq**. **Başına oyun gətirmək** – b a x **başına iş gətirmək. Başına pislik gətirmək** – namusuna təcavüz etmək, zorlamaq. **Başına tənbəki oyunu açmaq** – b a x **başına oyun açmaq**. **Başına toplamaq** – başına yığmaq. **Başına vurmaq** *məc.* – 1) fikirləşmək, düşünmək, götür-qoy eləmək. *Hey başıma vururam, ağlım bir şey kəsmir;* 2) b a x **başa qaxmaq**. **Başına yığılmaq** – bir şeyin və ya bir adamın ətrafına toplaşmaq, yığılmaq. *Çağırın Qeys ilə Fərhadı yığılsın başıma.* S.Ə.Şirvani. **Başına yığmaq** – ətrafına toplamaq (yığmaq). *Nuşirəvanın oğlu Nuşizad həbsxanadan çıxıb, başına çoxlu adam yığdı.* A.Bakıxanov. **Başında durmaq** – rəhbərlik etmək, başçılıq etmək. **Başında gəzdirmək** – çox hörmət və təzim etmək. **Başında qalmaq** – yadında qalmaq, vərdiş eləmək, unutmamaq. **Başında qoz sındırmaq** – çox incitmək, birinin üzərində hökmranlıq etmək, ağalıq etmək, istədiyini etmək. *Gənə onu istəyirsən ki, təzədən boynuyoğunlar gəlib bizim başımızda qoz sındırsınlar?* M.Hüseyn. **Başından atmaq** – b a x **başdan atmaq**. **Başından basmaq** – inkişaf etməyə, tərəqqi etməyə, irəli getməyə qoymamaq, sıxışdırmaq, əzmək. **Başından böyük (yekə) danışmaq** – danışığında həddini aşmaq, həddini bilməmək, yaxud öz yaşına, vəziyyətinə, biliyinə və s.-yə uyğun danışmamaq, yekə-yekə danışmaq. **Başından çıxarmaq** – 1) fikrindən çıxarmaq, yada düşülməmək, yadına salmamaq; 2) "öz" sözü ilə – uydurmaq, icad etmək. *Bunu öz başından çıxarmısan, yoxsa bir yerdən eşitmisən?* **Başından çıxmamaq** – daim düşündürmək, daim fikrində olmaq. **Başından keçmək** – 1) b a x **başına gəlmək**. *Başından çox şeylər keçib;* 2) b a x **başını vermək**. **Başından rədd etmək** – b a x **başdan eləmək (etmək).** *Bir az danışıqdan sonra atası Tükəzbanı ona* [Abdal Əsədə] *verib, başından rədd elədi.* B.Talıblı. **Başından tüstü çıxmaq** – son dərəcə hirslənmək, hiddətlənmək. *Kiçikxanımı görəndə, Nərimanın vücuduna od düşdü, başından tüstü çıxdı.* Mir Cəlal. **Başını ağartmaq** – b a x **baş ağartmaq. Başını ağrıtmaq** – b a x **baş ağrıtmaq**. *Əgər bu* [Erkək Tükəzban] *şəhərli arvadı olsa idi, mən heç fikir verməzdim və oxucuların başını ağrıtmazdım..* B.Talıblı. **Başını aşağı dikmək** – 1) başını sallamaq; 2) *məc.* rüsvay etmək, biabır etmək. *Kişilər belə deyirdilər ki, "kim bilir Bakıda bu arvadın başına nə iş gətirəcəklər, əgər bir iş olsa, sahibsiz arvaddır, onsuz da mahal içində bizim başımızı aşağı dikib"...* B.Talıblı. **Başını bağlamaq** – 1) qanun üzrə birinin malını, şeylərini və s.-ni siyahıya alıb, satılmasını, yaxud istifadəsini qadağan etmək; 2) bir şeyi almaq üçün beh vermək, sövdələşib qurtarmaq; 3) *məc.* evləndirmək. **Başını batırmaq** – tələf etmək, yox etmək, ortadan qaldırmaq. *Məhəllədə hər kəs bir az zirəklik göstərsəydi və ya baş qaldırıb, söz qaytarsa idi, qoçular dərhal onun başını batırardı.* H.Sarabski. **Başını bənd etmək** – 1) b a x **başını qarışdırmaq**; 2) *məc.* evləndirmək. **Başını bir yerə yığmaq**

– 1) bir yerə toplamaq, yekunlaşdırmaq, ümumiləşdirmək. *..Bu söhbətlərin başını bir yerə yığıb tərtibə salsan, təxminən belə bir mənzərə əmələ gələr..* R.Rza; 2) evləndirmək. **Başını bişirmək** – dilə tutub razı etmək, yola gətirmək, aldatmaq, tovlamaq. **Başını boşlamaq** – öz ixtiyarına buraxmaq, sərbəst buraxmaq, əl çəkmək, bənd olmamaq, mane olmamaq. **Başını böyütmək** – təngə gətirmək, darıxdırmaq, usandırmaq, sıxıntı vermək, əziyyət vermək. **Başını bulamaq** – başını tərpətməklə narazı olduğunu, xoşlanmadığını bildirmək. *Tərlanın bu cavabından razı qalmayaraq, başını bulayan dostu, onun qolundan tutub, stoluna tərəf çəkdi*. M.Hüseyn. *Eldar başını bulayaraq, Ayazı hədələdi.* Ə.Məmmədxanlı. **Başını buraxmaq** – yüyənini, cilovunu boşaldaraq yerişini sürətləndirmək (atın). *Məmməd bəyin atı cilov gəmirirdi, başını buraxmaq lazım idi*. Çəmənzəminli. *Mən irəlidən, Həsən arxadan atların başını buraxdıq*. S.S.Axundov. *Eldar .. atın başını buraxaraq, .. bir dəstə traktoristə yaxınlaşdı.* Ə.Məmmədxanlı; 2) bax **başına buraxmaq. Başını daşa döyür** – yersiz, haqsız, əsassız danışan adam haqqında. **Başını daşlamaq** – bax **başına daş salmaq. Başını dolandırmaq** – bax **başını qorumaq** 2-ci mənada. **Başını əkmək** – tovlamaq, aldatmaq, tovlayıb uzaqlaşdırmaq. *İndi qaldı İmranın bir cür başını əkib, İrana göndərmək.* S.S.Axundov. *Onun başın elə əkim ki, heç ruhu da inciməsin*. Z.Xəlil. **Başını girləmək** – bax **başını qorumaq** 2-ci mənada. *Qoysana .. daz başımızı girləyib saxlayaq.* S.Rəhimov. **Başını girləmək** – vaxtını boş-boş keçirmək. *O, iş görən deyil, başını girləyir.* **Başını itirmək** – ağlını itirmək, özünü itirmək, işinin əvvəlini, axırını bilməmək, çaşmaq. [İvan bəy:] *Pristavlar başlarını itirmişlər, bundan artıq da nə istəyirsən, canım!* N.Vəzirov. *Ara qarışdı, eşikağası başını itirdi, artıq o, qonağı ilə maraqlanmırdı*. Çəmənzəminli. **Başını külləmək** – bax **başını piyləmək**. **Başını qarışdırmaq** – 1) məşğul etmək, bir işlə vaxtını keçirmək. *Uşağın başını qarışdır, bu saat gəlirəm*; 2) birisini aldatmaq, fikrini yayındırmaq məqsədi ilə bir işlə məşğul etmək. *Başını qarışdırıb tez əkildi.* **Başını qaşımağa vaxtı olmamaq** – işdən göz açа bilməmək, işi son dərəcə çox olmaq. **Başını qatmaq** – bax **başını qarışdırmaq**. *Bu nümayiş yazılanların başını qatmaq idi.* M.S.Ordubadi. **Başını qınına çəkmək** – gizlənmək, özünü gizlətmək. *Salonda oturanlardan bir çoxu tısbağa kimi başını qınına çəkib, qorxu ilə baxırdı.* M.S.Ordubadi. *Tısbağa başını qınına çəkən kimi, topal qıçını altına çəkib gizlətdi*. Mir Cəlal. **Başını qorumaq** – 1) özünü qorumaq, özünü mühafizə etmək. *Xəstəlikdən başını qoru;* 2) birtəhər dolanmaq, keçinmək. **Başını qoymaq** – canını fəda etmək, canından keçmək. *Ölənədək dönə bilməz yarından*; *Meydan günü başın qoyar can ilə.* M.V.Vidadi. *Səri-kuyində qoyub başımı, bir uf demədim.* X.Natəvan. **Başını qurtarmaq** – canını qurtarmaq, xilas olmaq. *İki siçan qaçdı qurtardı başın; Seyl kimi cari edib göz yaşın*. S.Ə.Şirvani. **Başını piyləmək** – aldatmaq, tovlamaq. **Başını saxlamaq** – bax **başını qorumaq.** *O hələ də öz başını saxlaya bilmir. – Qürbət içrə fəhləliklə saxlar idi öz başın; Həm vətəndə dul anasın, yetim bacı, qardaşın*. A.Səhhət. **Başını sallamaq** – xəcalət çəkmək, cavab verə bilməmək, gözlərini yerə dikmək. **Başını sığallamaq** *məc.* – asta-asta və sezdirmədən aldatmaq, tovlamaq, yuxulatmaq. *Hərif onun başını sığallayıb əlindəkini aldı*. **Başını silkələmək** – bax **başını bulamaq. Başını tovlamaq** – aldatmaq. **Başını vermək** – başından, canından keçmək, canını fəda etmək. **Başını yarıb ətəyinə qoz tökmək** – birinə pislik edib, sonradan cürbəcür üsullarla könlünü almağa çalışmaq. **Başını yemək** – 1) məhv etmək; müxtəlif yol və vasitələrlə ortadan qalxmasına, yaxud ölümünə səbəb olmaq; 2) bax **başını batırmaq. Başını yerə qoymaq** – ölmək. [Vaqif:] *Sabah Kərim xan başını yerə qoydu, yenə ölkə qarışacaq, hər şəhərdə bir xan baş qaldıracaqdır*. Çəmənzəminli. **Başını yerə döymək** *məc.* – ibadət etmək, səcdə etmək, namaz qılmaq. *Yüz il başın yerə döysə, nə hasil zahidin bihudə ibadətindən*. Q.Zakir.

**Başını yığmaq (saxlamaq)** – cilovunu, yüyənini yığaraq, yerişini ağırlaşdırmaq (atın). *Üçüncü döngəyə xeyli qalmış Həsən gəlib məni keçdi. Bunu gördükdə mən atın başını yığdım.* S.S.Axundov. **Başını yırğalamaq** – b a x **başını bulamaq. Başını yola vermək** – b a x **başını qorumaq** 2-ci mənada. **Bir baş yuxarı** – hər hansı bir cəhətdən başqasından üstün. **Bir başdan** – ucdantutma, bir tərəfdən başlayaraq. *Bir başdan bu kitabları qəfəsələrə yığ.* **Boya-başa yetirmək (çatdırmaq, çıxarmaq)** – b a x **boy. Boya-başa yetişmək (yetmək, çatmaq, çıxmaq)** – b a x **boy. Bu başdan** – əvvəlcədən, qabaqcadan. *Mən heyrət içindəyəm, deyim sizə bu başdan.* S.Rüstəm. **Əvvəl başdan** – birinci növbədə, ilk əvvəl, qabaqca, hər şeydən əvvəl. *Əvvəl başdan deməliyəm ki...* **Əzəl başdan** – lap əvvəldən, lap başdan, çoxdan, yaranandan. *Əzəl başdan Bəsrə, Bağdad eliniz; Bəylər üçün ərməğandır teliniz.* M.V.Vidadi. *Əzəl başdan düşmənimdir üzü murdar qaranlıq; Hər torpağın öz eşqi var, hər millətin öz adı.* S.Vurğun. **Nə başını(zı) ağrıdım** – xülasə, müxtəsər (*ara söz kimi işlənir*). *Nə başınızı ağrıdım, tələbəmin yazısını düzəltdim, içində bəzi sözləri lap yerli-dibli atdım, gözəl bir "xatirat" çıxdı.* Qantəmir.

**BAŞABAŞ** *zərf* 1. Bərabər, qalıqsız, üstəliksiz, düz. *Başabaş çıxdı. Başabaş dəyişmək.*

2. Tamamilə, bütünlüklə, tamam. *O ağalar haqqını da verməyiblər başabaş.* S.Rüstəm.

**BAŞABATAN** *dan.* b a x **ağlabatan.** [Mehman:] *Hələ özü elə başabatan bir söz demir.* S.Rəhimov.

**BAŞABƏLA** *sif. kin. isteh.* Pis, yaramaz, bacarıqsız. *Başabəla təsərrüfatçı. Başabəla usta.*

**BAŞAĞRIDICI** *sif. dan.* Əziyyət verən, narahatlığa səbəb olan; cəncəl.

**BAŞAĞRISI** *is.* Əziyyət, narahatlıq. *Başağrısı da olur, amma bu barədə bir neçə söz deməyi lazım görürəm.* C.Məmmədquluzadə. □ **Başağrısı çəkmək** – zəhmət çəkmək, əziyyət çəkmək. [Vidadi:] *A Pənah, insan yəni axırda ölməyəcək? Bu beş gün dünyanın cahü cəlalı üçün bu qədər başağrısı çəkməyə dəyərmi?* Çəmənzəminli. **Başağrısı olmaq** – artıq yük olmaq, əziyyətə, narahatlığa səbəb olmaq. **Başağrısı vermək** – narahat etmək, incitmək, təngə gətirmək, bıqdırmaq, usandırmaq. [Qənbərqulu:] *Bir də çox danışmaq özü yaxşı sifət deyil, özgəyə gərək başağrısı verməyəsən.* B.Talıblı. *Sənə başağrısı verməyim deyə; Eşqimin kitabı qoy bağlı qalsın.* S.Rüstəm.

**BAŞAQ** *is.* Biçin zamanı yerə tökülən sünbül qırıntıları; sünbül. □ **Başaq etmək (yığmaq)** – yerə tökülən sünbülləri yığmaq. [Kolxozçu:] *Murad dayı, kolxoza başaq edəkmi?* İ.Əfəndiyev. *Başaq yığan oğlan hənirtiyə başını qaldırdı.* Ə.Əbülhəsən.

**BAŞAQÇI** *is.* Biçin zamanı tökülüb tarlalarda qalan sünbülləri toplayan adam.

**BAŞAQÇILIQ** *is.* Biçin zamanı yerə tökülən sünbülləri yığma işi. *Safo keçi kimi dabanını şaqqıldada-şaqqıldada il uzunu bu obanın içində ayaqyalın gəzir, onun-bunun küləşində başaqçılıq edir.* S.Rəhimov.

**BAŞAQLAMA** "Başaqlamaq"dan *f.is.*

**BAŞAQLAMAQ** b a x **başaqlanmaq**.

**BAŞAQLANMA** "Başaqlanmaq"dan *f.is.*

**BAŞAQLANMAQ** *f.* Başaq hasil etmək, sünbüllənmək, sünbül bağlamaq. *Əkinlər bütün başaqlanıbdır.*

**BAŞAQLI** *sif.* Sünbüllü, başağı olan (əkin haqqında).

**BAŞALTI** *is.* 1. Yastıq, balış; baş altına qoyula bilən hər bir şey.

2. Odun doğrayanda, ya yaranda onun altına qoyulan iri, yoğun bərk ağac parçası.

**BAŞ-AYAQ**[1] *zərf* 1. Tamamilə, başdan-ayağa, büsbütün, başdan-ayağa qədər. *Kafirə bax! Gör nə bədimandı bu! Dur qaçaq, oğlum, baş-ayaq qandı bu.* M.Ə.Sabir.

2. Tərs(əsinə), əksinə, başı ayağına və ayağı başına tərəf. *Baş-ayaq yatmaq. Baş-ayaq etmək. Baş-ayaq salmaq. – ..Ümumi yaşayış evindəki balaca otaqda səhər tezdən yuxudan qalxan cavanlar Cəmillə Tahiri bir çarpayıda baş-ayaq yatmış gördülər.* M.Hüseyn. □ **Baş-ayaq danışmaq (vurmaq)** – danışığının nə başı, nə ayağı olmaq, danışığında heç bir məntiq və rabitə olmamaq. [Şeyda:] *A kişi, sən baş-ayaq nə üçün danışırsan.* A.Şaiq. Görürəm sözlərim baş-ayaq vurur; *Bəzən quş yerinə dağ-daş uçur-*

*dur.* S.Vurğun. *Baş-ayaq vurursan, bəs deyil daha?* Z.Xəlil. **Baş-ayaq eləmək** – tərsinə çevirmək, qarışdırmaq.

**BAŞ-AYAQ**² *is. aşp.* Kəlləpaça.

**BAŞAYAQLILAR** *cəm zool.* Molyusk tipli dəniz heyvanları sinfi. *Demək olar ki, qabıqsız olan yumşaqbədənlilər də vardır, lakin bunların başlarında böyük əlcəkli barmaqlar inkişaf etmişdir. Bunlara başayaqlılar deyilir.* “Zoologiya”.

**BAŞ-BAŞA** *zərf* Bir yerdə, yan-yana, bir-birinə sıxılaraq. ☐ **Baş-başa durmaq** – bax **baş-başa vermək** 3 və 4-cü mənalarda. **Baş-başa gəlmək** – üz-üzə gəlmək, rastlaşmaq. *Usta yarı yol getməmişdi, bir ayrı kişi ilə baş-başa verib toqquşdular və ikisi də üzlərini turşudub, sudan çıxdılar ki, bir-birini döysünlər.* Çəmənzəminli. **Baş-başa vermək** – 1) bir-biri ilə gizli danışmaq, məhrəmanə danışmaq, sirləşmək; // *məc.* quşlar haqqında. *Yoxsa danışırsız dilbər sözünü; Veribsiniz nə baş-başa, durnalar?* Q.Zakir. *Ötədəki iki quşcuğazın baş-başa verib də həsb-hal etməsi .. nə qədər şairanə.* H.Cavid; 2) işlərini, dərdlərini bir yerdə müzakirə etmək, götür-qoy eləmək, məsləhətləşmək. *Gecə sübhədək iki yoldaş baş-başa verib tədbir tökdülər.* – [Kazım:] *İllərdən bəri yan-yana yaşayan, adət və qaydaları bir, yalnız dinləri başqa olan bu iki ailə baş-başa verib, bir-birinin dərdinə ağlayırdı.* Çəmənzəminli; // bir yerdə çalışmaq, əlbir olmaq, birgə hərəkət etmək. *Baş-başa verməyincə daş yerdən çıxmaz.* (Ata. sözü); 3) bir yerdə oturmaq, yan-yana oturmaq, bir yerə cəmlənmək. [Qənbərqulu:] [Əsgər] *cibindən bir qəpik çıxarıb ət almazdı ki, aparıb evində uşaqları ilə baş-başa verib abgüştdən-zaddan bişirib yesin.* B.Talıblı; 4) bir-birinə yaxın durmaq, yanaşı durmaq, yan-yana düzülmək, durmaq. *Xəzər sahilində verə baş-başa; Qocaman çinarlar, yekə ağaclar.* S.Rüstəm. *Meşələr görmüşəm qoca palıdlı; Hündür vələsləri verib baş-başa.* R.Rza; 5) bir yerə yığışmaq, büzüşmək, yazıq-yazıq bir-birinə sıxılıb durmaq. *Uşaqlar baş-başa verib oturublar. Soyuqdan quşlar baş-başa verib bir daldalanacaqda durmuşdu.*

**BAŞ-BEYİN** *is.* bax **baş** 1-ci mənada. ◊ **Baş-beyin getmək** – səs-küydən, danışıqdan və s.-dən dəng olmaq, qulaqları tutulmaq, əziyyət çəkmək, təngə gəlmək. [Sübhanverdizadə:] *Gör kim harada oturub, kişinin kabineti də yoxdur. Az qalır baş-beyni getsin.* S.Rəhimov. **Baş-beyni aparmaq** – dəng etmək, qulağını batırmaq (son dərəcə çox danışmaqdan, qışqırmaqdan, səs-küydən). [Səfərqulu:] *Baş-beynimizi aparma, bizim dərdimiz sənə qalmayıb.* N.Vəzirov.

**BAŞBİLƏN** *sif. dan.* Başçı, ağsaqqal. *Başbilənsiz iş olmaz.* (Ata. sözü). *İş başbilənsiz olmaz; Sər süfrə sənsiz olmaz!* M.Ə.Sabir. [Tahirzadə:] *Bu camaatın bir başbiləni, bu ölkənin bir sahibi yoxdurmu, ilahi!* Mir Cəlal. [Alxan:] *Bu cavan qartalı özünüzə başbilən seçin.* İ.Əfəndiyev.

**BAŞCIĞAZ** “Baş”dan oxş.

**BAŞCIQ** *is.* Kiçik baş.

**BAŞCIL** *sif.* Başçılıq edən, rəhbər, əsas.

**BAŞÇI** *is.* Bir işin başında duran adam; rəhbər, sədr, rəis, böyük. *Araz silahlı dəstə başçılarını təyin etdikdən sonra onlara müəyyən göstərişlər verib tüfəngləri payladı.* A.Şaiq.

**BAŞÇILIQ** *is.* Rəhbərlik, böyüklük, rəislik, sədrlik, bir işin başında durma. ☐ **Başçılıq etmək** – rəhbərlik etmək, bir işin başında durmaq. [Ulduz] *çox vaxt bu oyunlarda zirəkliyi ilə dəstəyə başçılıq edirdi.* Ə.Məmmədxanlı.

**BAŞDAN** *zərf* Əvvəl(in)dən, ibtida(sın)dan; təzədən, yenidən. *Başdan danışmaq. Başdan oxumaq. Başdan başlamaq.*

**BAŞDAN-AYAĞA** bax **başdan-başa**. *Başdan-ayağa külli-vücudum oda yandı.* Nəsimi. [Nurcahan:] *Mən başdan-ayağa sirr dağarcığıyam.* N.Vəzirov. [Əli bəy:] *A kişi, heç kəsin sözünə qulaq asma. İstəyirsənsə oğlun adam olsun, şkolaya qoy. O ki qaldı axund Molla İman, onun fikri başdan-ayağa yanlış və xatadır.* S.S.Axundov. ☐ **Başdan-ayağa süzmək** – bax **başdan-başa süzmək** (“**başdan-başa**”da). [Yəhya Kamal] *həyati başdan-ayağa süzdü.* Mir Cəlal.

**BAŞDAN-BAŞA** *zərf* Bütünlüklə, tamamilə, hər yeri, hər tərəfi; bütöv, tamam, səlt. *Ət deyil, başdan-başa yağdır. Onun dedik-*

*ləri başdan-başa səhvdir. Şəhərə başdan-başa asfalt döşənmişdir. Dəniz başdan-başa buzlarla örtülmüşdür. – Uşaqları tapıb, çiyələk, göbələk toplamağa, ya dərədə balıq tutmağa gedərdik. Bu dərə başdan-başa su qaynağı idi.* A.Şaiq. *Yaxşılıq insana bir sənət olsun; Dünya başdan-başa qoy cənnət olsun!* S.Vurğun. *O səhra ki başdan-başa tikandı, qumdu; Döndü sərin kölgə salan sərvliklərə.* Ə.Cəmil. ☐ **Başdan-başa süzmək** – hər tərəfini, hər yerini gözdən keçirmək, istehzalı və ya şübhəli nəzərlə başından-ayağına qədər baxmaq. *Nəhayət, hacı gəldi. İçəri girincə əvvəlcə otağı bir quşbaxışı ilə başdan-başa süzdü.* A.Şaiq.

**BAŞDANSOVDU, BAŞDANSOVMA** *sif.* Diqqətsiz, tələsik, könülsüz. *Başdansovma iş. – Mehmanın başdansovdu sözündən, soyuq söhbətindən sonra gələn adamlar dağılışıb getdilər.* S.Rəhimov. // *Zərf mənasında.* Başdansovma etmək. *Başdansovma cavab vermək.*

**BAŞDAŞI** *is.* Qəbrin üzərində baş tərəfdə sancılan daş və s.-dən nişangah. *Əsgər çox qədimdən qalmış hörgülərə, qalın barılara, sarı mamırlı başdaşılarına, üstü ağır qayalarla örtülmüş qəbiristanlığa təsadüf edirdi.* S.Rəhimov.

**BAŞGİCƏL(LƏ)DİCİ** *sif.* Adamın başını gicəldən, dolandıran hər şey.

**BAŞGİCƏLLƏNDİRƏN, BAŞGİCƏLLƏNDİRİCİ** b a x **başgicəl(lə)dici.**

**BAŞGİCƏLLƏNMƏ** *is.* Müvazinət hissinin itməsi, gözlərin qaralması və başın fırlanması şəklində təzahür edən yarımbayğınlıq halı.

**BAŞ-GÖZ** b a x **baş** 1-ci mənada. [Azad bəy:] *Səfərqulu bəy həqiqəti bilib baş-gözünü əzdikdə, mən həkimin üstə yüyürməyəsiniz.* S.S.Axundov.

◊ **Baş-göz eləmək** *dan.* – evləndirmək.

**BAŞIAÇIQ** *zərf* və *sif.* Başında heç bir şey olmadığı halda, papaqsız, başı örtüksüz. *Başıaçıq gəzmək. – Səkkiz yaşında uşaq ikən kəndimizdə .. başıaçıq, ayaqyalın təbiətin mərhəmətli qucağında, məişətin ağır və zəhərli hallarından xəbərsiz yaşardım.* S.S.Axundov.

**BAŞIALOVLU** b a x **başılovlu.** *Nənəqız başıalovlu bazarı axtarıb qızlarını tapdı.* S.Rəhimov.

**BAŞIAŞAĞA, BAŞIAŞAĞI** 1. *zərf* Başını aşağı dikmiş halda, başını aşağı salmış halda. *Sərdar evlərinin qabağında bir daxmaya girib, səhərdən axşama kimi başıaşağı iynə vurmaqdadır.* C.Məmmədquluzadə.

2. *zərf* Tərsinə dönmüş, baş tərəfi aşağıya çevrilmiş. *Stəkanı başıaşağı qoymaq. Başıaşağı durmaq.*

3. *zərf* Getdikcə aşağıya tərəf; mayili, eniş, yuxarıdan aşağı. *Başıaşağı gedən yol. Dağdan başıaşağı enmək.*

4. *zərf* Çayda suyun axıb getdiyi tərəfə. *Çayla başıaşağı üzdüm.*

5. *sif. məc.* Sakit, dinc, fağır, heç kəslə işi olmayan, ancaq öz işi ilə məşğul olan. *Başıaşağı adam. – Səfər doğrudan da qızların xoşuna gələnlərdən deyildi. Fağır, başıaşağı bir oğlandı.* Ə.Haqverdiyev. *Evlənən kəsbkar, başıaşağı olmalı imiş.* Çəmənzəminli. *Pəri xanım Rüxsarəni başıaşağı, təmiz bir qız və dünya gözəli bir mələk kimi tanıyırdı.* S.Rəhimov.

**BAŞIBAĞLI** *sif. dan.* 1. Ağzıbağlı, düyünlənmiş: örtülü, qapalı. *Qəhrəman bu təzə düzələn dəftərxanaya girsə, yuxarıdan başıbağlı gələn kağızları açar, oxuyar, özü də o kişilərin elmlərini öyrənə bilər.* S.Rəhimov.

2. Beh verilmiş, satılmış, lakin hələlik aparılmamış (mal və s. haqqında).

3. İstifadəsi, toxunulması rəsmi surətdə qadağan olunmuş. *Başıbağlı mal. Başıbağlı mülk.*

4. *məc.* Evli, ailəli, arvadı olan.

**BAŞIBATMIŞ** *sif.* və *is. dan.* Söyüş, qarğış yerində işlənən ifadədir. [Xırdaxanım:] *Xeyir olmamış nə var, a başıbatmış!* N.Vəzirov. [Cümşüd:] – *Əlbəttə, xan! – dedi, – bilirsən ki, bu başıbatmış dörd məlik mənim atamla da düşmənçilik ediblər...* Çəmənzəminli. *Səhər iclas! Gecələr də qaçaq qabağına çıxmaq və bu başıbatmışlar bir aydır ki, yuxunu mənə haram eləyirlər.* B.Talıblı.

**BAŞIBƏLALI** *sif.* Çox müsibət çəkmiş, daim bəla və uğursuzluğa rast gələn, həmişə əziyyət və zəhmətdə olan; talesiz, bəxtsiz (bəzən istehza və ya tənə ilə deyilir). *Nə soxulmusan araya, a başıbəlalı fələ? Nə xəyal ilə olubsan belə iddialı, fələ.* M.Ə.Sabir.

**BAŞIBƏRK** *sif.* Sürülürkən başını saxlamaq çətin olan, yüyəni zorla idarə edilə bilən (at haqqında). *Başıbərk at.*

**BAŞIBOŞ** *sif.* 1. Axmaq, sarsaq, səfeh, gic. 2. *məh.* Ərindən boşanmış; dul.

**BAŞIBÜTÖV, BAŞIBÜTÜN** *sif. dan.* Tamam, bütün, əl dəyməmiş, toxunulmamış.

**BAŞIDAŞLI** *sif.* və *is. dan.* Bədbəxt, başıbəlalı, biçarə, yazıq, məzlum (bəzən qarğış, məzəmmət yerində işlənir). *Məgər gözlüyün ixtirası və onun işlədilməsi də başıdaşlı kafirlərin işi deyilmi?* M.F.Axundzadə. *Ay başıdaşlı kişi, dinmə, uşaqdır uşağım.* M.Ə.Sabir. *Bir kənddə camaat ağlaşa-ağlaşa yüzbaşının ayağına yıxılıb: "Bəs toxumluğu aparırsınız, biz başıdaşlı nə əkək?" – deyirdi.* Çəmənzəminli. [Arvad:] *Arabaçı başıdaşlı səhər gedə bilməzdi?* H.Sarabski.

**BAŞIDOLU** *sif. dan.* 1. Ağıllı, dərrakəli. [Mustafa bəy:] *Çünki, doğrudan da, başıdolu oğlansan.* Ə.Haqverdiyev.
2. *məc.* Məst, sərxoş, kefli.

**BAŞIDÜMÜK** *sif. məh.* Bir işlə (əsasən əyləncə ilə) başı qarışmış olan.

**BAŞIƏTLİ** *sif. dan. zar.* Pullu, varlı, dövlətli.

**BAŞIKÜLLÜ** *sif. dan.* Bədbəxt, yazıq, məzlum, fağır.

**BAŞIQAPAZLI** *sif.* və *is. dan.* Daim əzilən, təhqir edilən, köməksiz, müdafiəsiz, yazıq, fağır, məzlum, bədbəxt, aciz adam haqqında.

**BAŞIQARLI** *sif.* Təpəsi qar ilə örtülü. *Azərbaycanın bu gözəl guşəsində* [Zaqatala qoruğunda] *başıqarlı dağlara, qalın meşələrə, geniş çəmənlərə, qıjıltı ilə axan çaylara və şən quşlara baxdıqca, biz özümüzü əfsanəvi bir aləmdə hiss edirdik.*

**BAŞIQIRXIQ** *sif.* Başı qırxılmış olan, başını qırxdırmış. *Keçən ilin aprelində gödərək-tösmərək, üzütüklü, başıqırxıq bir kişi Yevlax vağzalında o tərəf-bu tərəfə qaçır, vaqonlara içi dolu konteynerlər yükləyirdi.* "Kirpi".

**BAŞIQOTAZLI** *sif.* Başında qotaz olan, başına qotaz bağlanmış. [Məşədi Məmməd] *əlində başıqotazlı təsbehini çevirərək, baqqal Əbdülhəsənin dükanına gəldi.* B.Talıblı. *Qız üçün başıqotazlı gümüş kərənaylar, üstü yumru süngərə bənzər qara ayaqdaşı alınardı.* H.Sarabski.

**BAŞILOVLU** *zərf* Çox tələsik halda, təşviş və təlaş içində, həyəcan və iztirablı halda. *Kişi yuxudan dik atıldı, başılovlu yazı stoluna sarı qaçdı.* Mir Cəlal.

**BAŞINAĞACI** *is. bot.* Dağ-meşə rayonlarında bitən kol bitki.

**BAŞINALIQ** b a x **başlı-başınalıq.** *Bəyəm dünya başınalıqdır? – deyə Safo ayağa qalxıb, kahanın başında o baş-bu başa gəzindi.* S.Rəhimov.

**BAŞIÖRTÜLÜ** *sif.* Başı bir şeylə örtülü.

**BAŞIPAPAQLI** *is. dan.* Kişi. *Atlı əlindən yollardan keçmək olmur, kənddə-kəsəkdə başıpapaqlı qalmayıb, hamısını yığıblar.* Çəmənzəminli. *Tıntın Musanın nəvəsi ora gedə bilmədi. Atası ölmüş, evlərində başıpapaqlı bir özü qalmışdı.* Qantəmir. *Hüseyn indi bu evin yeganə başıpapaqlısıdır.* S.Rəhman.

**BAŞIPOZUQ** *sif.* Heç bir nizam və intizama tabe olmayan, heç bir qaydaya riayət etməyən; nizamsız. *Ətraf küçələr başıpozuq camaatla dolu idi.* M.S.Ordubadi. // İs. mənasında. *Başıpozuqlar kimi belə nizamsız və dağınıq halda yeriyərək, kəndə girmək onun* [zabitin] *fikrincə, yaxşı təsir bağışlamazdı.* M.Hüseyn.

**BAŞIPOZUQLUQ** *is.* Nizamsızlıq, başlı-başınalıq; heç bir nizam və qaydaya tabe olmadığı hal, vəziyyət. [Bülənd:] *Bu nədir, belə də başıpozuqluq olarmı?* Ə.Əbülhəsən.

**BAŞISOYUQ** *sif.* Tapşırılan işə, vəzifəsinə soyuq baxan; səhlənkar, diqqətsiz, qeydsiz. *Başısoyuq adam.* – [Xosrov:] *..Aldığını və eşitdiyini düşünməyəcək, çaşqın, başısoyuq adamlardan deyiləm.* A.Şaiq.

**BAŞISOYUQLUQ** *is.* Öz işinə, vəzifəsinə soyuq baxma, səhlənkarlıq; diqqətsizlik, qeydsizlik. *Başısoyuqluq etmək* (*göstərmək*). *Başısoyuqluğu nəticəsində işini vaxtında qurtara bilmədi.* – [İmamyar:] *Bu hələ özü də başısoyuqluqdur.* C.Cabbarlı. *Əhməd, işə başısoyuqluq göstərirsən...* S.Rəhman.

**BAŞIYEKƏ** *sif.* Yekə-yekə danışan, dikbaş, danqaz, qaba.

**BAŞIYUXARI** *zərf* Alçaqdan yüksəkliyə, aşağıdan yuxarıya doğru; bir yerin aşağı hissəsindən yuxarı, baş hissəsinə doğru. *Dağa başıyuxarı çıxmaq. Başıyuxarı küçə ilə*

*getmək. – Lado .. başıyuxarı Cəbrayılın evinə tərəf getməyə başladı.* S.Rəhman.

**BAŞKƏSƏN** *sif.* 1. Cəllad, insan qatili, xunxar; vəhşi, yırtıcı, dələduz. [Salman:] *Mən o evyıxanları, o başkəsənləri deyirəm ki, sərhədləri, ölkələri, okeanları aşıb, quzğun kimi tökülüblər Koreyaya.* Mir Cəlal.

2. *məc. dan.* İnsafsız, zalım, çox bahacıl adam haqqında.

**BAŞQA** 1. *sif.* Bu yox, digər, o biri, əvvəlkindən fərqli; qeyri, ayrı, sair, özgə. *Başqa adam. Başqa iş. Başqa yer. Başqa aləm. Başqa cür. Başqa vaxt. Başqa sayaq. – Deyirlər özgə yerin əhli hüsni-zibadır; Bu şuxlərdə vəli başqa bir məlahət var.* S.Ə.Şirvani. *Qonşu həyətin qapısı başqa küçəyə açılırdı.* Mir Cəlal.

2. *qoş.* Qeyri, savay. *Yusifin Səlimdən başqa bir oğul və iki qızı var idi.* N.Nərimanov. *Torpaq döşəmə üzərində bir həsir qırığından başqa heç nə yox idi.* Ə.Məmmədxanlı. [Uğur:] *Səndən yaxşılıqdan başqa heç nə eşitməmişəm.* İ.Əfəndiyev.

3. *İs. mənasında.* Yad, özgə, başqası. *Başqaları buna nə deyər? Başqalarının yanında. Bunu mənə başqası dedi.* – [Ramazan:] *Adamın öz daxması başqalarının sarayından qiymətli görünür.* M.Hüseyn.

**BAŞQA-BAŞQA** *sif.* Bir-birinə bənzəməyən, oxşamayan, bir-birindən tamamilə fərqli; müxtəlif. *Başqa-başqa fikirlər. Başqa-başqa zövqlər. Başqa-başqa məsələlər. Onlar başqa-başqa adamlardır.* – [Qəhrəman:] *Biz ki, başqa-başqa adamlar deyilik.* S.Rəhimov. // Ayrı-ayrı. *Biz başqa-başqa yerlərdə yaşayırıq.*

**BAŞQALAŞDIRMA** "Başqalaşdırmaq"-dan *f.is.*

**BAŞQALAŞDIRMAQ** *f.* Başqa şəklə (hala, vəziyyətə) salmaq, tamamilə dəyişdirmək.

**BAŞQALAŞMA** "Başqalaşmaq"dan *f.is.*

**BAŞQALAŞMAQ** *f.* Başqa vəziyyətə, şəklə, hala düşmək; başqa cür olmaq; tamamilə dəyişmək. *İri, kələ-kötür ətəkləri qaratikan kolları ilə döşənmiş dağlar arasından yuxarı qalxdıqca təbiət və hava bütün başqalaşır.* A.Şaiq. *Bir də sevgilimi aldatmaq üçün; Dəyişib cildimi başqalaşmadım.* S.Vurğun. *Gəlin Həpirin evinə qədəm qoyan gündən başqalaşdı.* Mir Cəlal.

**BAŞQALAŞMIŞ** *f.sif.* Başqa vəziyyətə, şəklə, hala düşmüş; başqa cür olmuş; dəyişmiş. *Yenə Ulduzun dalğın və başqalaşmış səsi eşidilir.* Ə.Məmmədxanlı. [Veys] *Bakıdan tamamilə başqalaşmış halda qayıtdığını zənn edirdi.* Ə.Əbülhəsən.

**BAŞQALIQ** *is.* Başqa vəziyyətdə, başqa şəkildə olma; dəyişiklik. *Hər şeydə bir başqalıq gördüm. – Bir gün bağda böyük hovuzun qarşısında oturmuşdum. Gəlib qalib qarşımdan keçirdiniz. Bu kərrə sizdə bir başqalıq vardı.* S.Hüseyn. [Müəllim:] *Son zamanlarda Xosrovun həyatı və əhvali-ruhiyyəsində siz bir başqalıq hiss edirmisiniz?* A.Şaiq.

**BAŞQIRD** *is.* Başqırdıstan Respublikasında yaşayan türk dilli xalq və bu xalqa mənsub adam.

**BAŞQIRDCA** *zərf* Başqırd dilində.

**BAŞ-QULAQ** *is. dan.* Sir-sifət, görünüş, təhər-töhür; şəkil, qiyafə. *Baş-qulağın düzəlməyib, çox da basıb guruldama; Dinmə, danışma, yat, bala! Sən deyən olmayıb hələ!* M.Ə.Sabir.

◊ **Baş-qulaq aparmaq, baş-qulağı dəng etmək** – b a x **baş-beyin aparmaq** ("**baş-beyin**"də). [Yolçu:] *Bu naqqal haradan gəlib çıxdı, baş-qulağımızı apardı.* M.İbrahimov.

**BAŞLAMA** "Başlamaq"dan *f.is.*

**BAŞLAMAQ** *f.* 1. Bir işə girişmək, *şüru etmək. İşə başlamaq. Müşavirəyə başlamaq. İnşaata başlamaq. Yeni zavod dünəndən işləməyə başlamışdır. – Elə ki, sabah oldu, Sona fars dilini oxumağa başladı.* N.Nərimanov. *Marallarım mövizə kitablarını rəfdən alıb, tozlarını təmizləyib başladılar əzbərləməyə.* Ə.Haqverdiyev.

2. Bir işin, halın, keyfiyyətin, hadisənin və s.-nin ilk əlamətlərini göstərmək. *Qocalmağa başlamaq. Bacadan tüstü görünməyə başladı. Hava qaralmağa başladı. Yağış damcılamağa başladı. – Biçarə münəccimbaşının ərvahı uçub, başladı yarpaq kimi titrəməyə.* M.F.Axundzadə. *Atlı yaxınlaşdıqca onun qucağındakı heyvan da aydın görünməyə başladı.* M.Hüseyn.

3. Bir işin əsası qoyulmaq, əmələ gəlmək, meydana gəlmək. *Mühərrirlik sənəti Azərbaycanda, demək olar ki, Mirzə Fətəli*

*Axundzadə ilə, xüsusən "Əkinçi"ni yaradan Həsən bəy Zərdabi ilə başlamışdır*. (Qəzetlərdən).

**BAŞLANĞIC** *is.* 1. Bir işin, hadisənin ilk anı, əvvəli, ibtidası. *Bu hələ işin başlanğıcıdır. Dərs ilinin başlanğıcı. – Bu hadisə bütün nəzmiyyə təşkilatının tərk-silah etdirilməsi üçün bir başlanğıc idi.* M.S.Ordubadi. *Xanlar buraya .. yaradacağı əsərin başlanğıcı üçün yenə də yollar, cizgilər axtarmağa çıxmışdı*. S.Rəhimov. *Ancaq başlanğıc üçün bu heç də pis deyildi*. Ə.Əbülhəsən. // Çıxış nöqtəsi. *Hadisənin başlanğıcı.*

2. İlk əsas, ilk səbəb, ilk mənbə; ilkin.

3. Bir şeyin müqəddiməsi, giriş hissəsi, birinci hissəsi. *Kitabın başlanğıcı. Musiqinin başlanğıcı. Pyesin başlanğıcı.*

**BAŞLANILMAQ** *məch*. Şüru edilmək, girişilmək. *Müzakirələrə hələ başlanılmayıbdır. İnşaata yaxın günlərdə başlanılacaqdır*.

**BAŞLANIŞ** *is*. Bir işin, hadisənin əvvəli, ibtidası, başı; başlanma, başlanğıc. *Tamaşanın başlanışı saat 8-dədir.*

**BAŞLANMA** "Başlanmaq"dan *f.is.*

**BAŞLANMAQ** *f.* 1. Meydana çıxmaq, törəmək; törəməyə, ortaya çıxmağa, əmələ gəlməyə başlamaq. *Mübahisə başlandı. Əkin işləri başlandı. Vuruşma top atəşi ilə başlandı. Danışıqlar saat 8-də başlandı.*

2. Bir şeyin çıxış nöqtəsini, başlanğıcını təşkil etmək. *..Unutma ki, Girdman torpağının sərhədi Kür çayının o tayından başlanır*. M.Hüseyn.

**BAŞLATMAQ** *icb*. Başlamağa, girişməyə məcbur etmək və ya tapşırmaq.

**BAŞLI** *sif.* 1. Başı, təpəsi olan.

2. *məc. dan*. Ağıllı, zehinli, çox bilikli. *Dünən* [Abbasın] *evinə gələn kim imişsə, başlı adam imiş, "içərilərdən" gəlmişmiş*. Mir Cəlal.

**BAŞLI-BAŞINA** *zərf* 1. Nəzarətsiz, baxımsız, himayəsiz. *Başlı-başına qoymaq* (*buraxmaq*). *Başlı-başına qalmaq.* – [Sərdar Rəşid:] *Mən heç vaxt səni başlı-başına qoyub getmək istəməzdim.* M.S.Ordubadi.

2. Öz bildiyi kimi, özbaşına, kefi istədiyi kimi, sərbəst. *Başlı-başına işləmək. Başlı-başına hərəkət etmək.*

3. Öz-özünə, özbaşına, başqasının köməyi olmadan. [Dəmirov:] *Yoxsa başlı-başına belə bir bağ düzün ortasında əmələ gələ bilməz*. S.Rəhimov.

4. Boş, adamsız, sahibsiz. *Başlı-başına qalmış ev* (*bağ*). – *..Gurultu ilə keçən soldat oynağı olan küçələr indi başlı-başına idi.* M.S.Ordubadi.

**BAŞLI-BAŞINALIQ** *is*. Özbaşınalıq, hərki-hərkilik, qanunsuzluq, nizamsızlıq. *Başlı-başınalıq etmək.*

**BAŞLICA** 1. *sif.* Ən əsas, ən mühüm, ən ümdə. *Başlıca səbəb. Başlıca məsələ. Başlıca işlər irəlidədir.*

2. *zərf* Əsasən, ən ziyadə, ən çox, ən əvvəl. *Onun başlıca məşğul olduğu iş – yazıçılıqdır.*

**BAŞLIQ**[1] *is*. 1. Yağışdan, soyuqdan, küləkdən qorunmaq üçün başa geyilən örtü. *..Əhməd yazıb atasından özü üçün bir başlıq və bacısı üçün bir əlcək istəmişdi*. S.S.Axundov. *Əynində boz şinel, başında başlıq; Nəysə pıçıldayır o, fəhlələrə*. S.Vurğun. *Başlıq örtmüş, uzunboğaz çəkmə geymiş Səriyyə içəri girəndə, Salam dik ayağa qalxdı*. Mir Cəlal.

2. Keçmişdə: qadınların qızıl və gümüşdən qayrılıb, baş örtüsü altından qoyduqları qızıl və gümüş bəzək; cütqabağı, gəlintacı.

3. *xüs.* Sərlövhə, məqalənin adı; əsərin, ya qəzetin başda yazılan qısa adı. *Məqalənin başlığı.* // Qəzetdə bir neçə məqalə üçün verilən ümumi sərlövhə. *Bütün respublika qəzetləri onun* [Şamamanın] *bu yeni vədini böyük başlıqlarla görkəmli yerlərdə çap edirdi.* İ.Əfəndiyev.

**BAŞLIQ**[2] *is. etnoqr*. Köhnə məişətdə: ərə verilən qızın ata-anasına tədarük və cehiz düzəltmək üçün oğlan tərəfindən verilən mal, yolpulu. [Xacə:] *Nə eybi var, razıyam, ancaq oğlun otuz kisə başlıq verməlidir..* "Aşıq Qərib". *Reyhan .. büsbütün məyus qayıtmışdı. Çünki qıza ağır başlıq istəmişdilər*. A.Şaiq.

**BAŞLIQALTI** *is. köhn.* Qadınların başlıq altından örtdükləri kiçik baş örtüsü.

**BAŞLIQLI** *sif.* Başında başlıq olan, başlıq geymiş. *Başı başlıqlı bir neçə adam da yenə maşının üstünə toplanmışdı.* S.Rəhimov.

// Başlıqla bitişik olan paltar (plaş). *Ploskov vücudunu başlıqlı, brezent plaşda gizlətmişdi.* Mir Cəlal.

**BAŞLIQOTU** *is. bot.* Sarıçiçəkli çoxillik ot bitkisi.

**BAŞMAQ** *is.* 1. *köhn*. Üzüörtülü, daban tərəfi və pəncənin yarısı açıq, nallı kişi və qadın ayaqqabısı. [Sona:] *Xalçanı götürüb gəlirdim, başmağımın tayı ayağımdan sürüşüb çıxdı*. M.F.Axundzadə. [Şeyx Şəban] *yağış yağanda sel gətirən köhnə başmaqları, çustları .. yığıb, qəlibə vurub, yamayıb ucuz qiymətlə .. satırdı.* Ə.Haqverdiyev. [Kor kişinin] *əyninə geydiyi ləzgi şalından büzməli çuxası, ayağındakı dikdaban başmağı köhnə bir adam olduğunu bildirirdi*. S.Hüseyn. // Ümumiyyətlə, ayaqqabı. *..Mirzə Məmmədəli girir içəri, salam verib başmaqlarını çıxardır və keçib oturur öz yerində*. C.Məmmədquluzadə. *..Xasay başmaqların taqqıltısından hiss etdi ki, Məsmə qarı qapıya tərəf gəlir.* M.Hüseyn.

2. *xüs.* Müxtəlif maşın və mexanizmlərdə: dayaq, qəlib, qoruyucu və s. vəzifəsini görən cürbəcür hissələrin adı. *Başmaq qalınlığı 15-19 mm və uzunluğu 30-40 sm olan polad halqadan ibarətdir ki, bu da qoruyucu kəmərin aşağı ucuna bağlanır.* Quliyev.

◊ **Başmaqları da razı olmaq** – ürəkdən, tamamilə razı olmaq. *Məsmənin Hacı Seyid kişiyə getməsinə Pərzadın başmaqları da razı idi*. Mir Cəlal. **Başmaqlarını cütləmək, başmaqlarını cütləyib qabağına qoymaq** *məc.* – qovmaq, rədd etmək, çıxıb getməsini tələb etmək. *O oldu ki, Həsənovun başmaqlarını cütlədilər qabağına..* Mir Cəlal. **İki ayağını bir başmağa dirəmək (qoymaq, soxmaq)** – inad etmək, tərslik etmək, dediyindən inadla əl çəkməmək. *Qədim dayı Tükəz xalanın öyüd-nəsihətinə baxmadı, o, iki ayağını bir başmağa qoydu və inad elədi*. S.Rəhimov.

**BAŞMAQÇI** *is*. Başmaq (ayaqqabı) tikən və ya satan adam; çəkməçi. *Boyaqçıya, başmaqçıya, dərziyə; Havaxtadək olacağıq iki qat.* Q.Zakir.

**BAŞMAQÇILIQ** *is*. Başmaqçı (çəkməçi) sənəti, peşəsi. *Başmaqçılıq etmək. – Arşak onlara öz bacardığı saatsazlıq, başmaqçılıq, zərgərlik sənətlərini öyrədirdi.* M.S.Ordubadi.

**BAŞMAQLI** *sif*. Başmaq geymiş, ayaqlarında başmaq olan. *Arvad, kişi, oğlan, qız; Gön çarıqlı, başmaqlı; Gedir qoruq-qaytaqsız; Gəlin, qızlar yaşmaqlı.* A.Səhhət. *Ortaboylu, arıq, başmaqlı bir kişi məsciddən çıxıb gəldi*. Mir Cəlal.

**BAŞMAQSEYRİ** *is*. Hava almaq və dincəlmək üçün olduğu yerdən bir qədər kənara çıxıb gəzmə; gəzinti. *Başmaqseyrinə çıxmaq. – Bikar olan vaxtı görürdün ki,* [Usta Ağabala] *özünə bir neçə yoldaş tapıb şəhərdən çölə "başmaqseyrinə" gedir..* Çəmənzəminli. *Günlərin bir günündə Abbasqulu ağa axşam sərinliyində kəndin kənarına başmaqseyrinə çıxır.* Ə.Sadıq.

**BAŞSAĞLIĞI** *is*. Yaxın adamı ölmüş bir şəxsə, ya ailəyə təsəlli vermə, səbir vermə; təziyə. ☐ **Başsağlığı vermək** – yaxın adamı ölmüş şəxsə təsəlliverici sözlər demək. *Bax, buradanca dönək konsulgilə, ona ayaqüstü başsağlığı verək.* C.Məmmədquluzadə. [Kazım:] *Bir də gördüm ki, məclisdə durub gedənlər yanıma gəlib mənə başsağlığı verirlər.* Çəmənzəminli.

**BAŞSINDIRAN** *sif. dan.* Çox çətin, mürəkkəb, həlledilməz. *Başsındıran məsələ.*

**BAŞSIZ** *sif.* 1. Başı olmayan. *Başsız bədən.*

2. *məc*. Ağılsız, gic, axmaq. // Çox huşsuz.

3. Böyüksüz, sahibsiz, yiyəsiz, baxıcısız, nəzarətsiz, başçısı olmayan*. Başsız təsərrüfat. Başsız uşaq.* // Zərf mənasında. *Başsız qalmaq. Başsız qoymaq. – Başsız qalıb ayaqları iftan olan çocuq! Ey dərbədər gəzib ürəyi qan olan çocuq!* M.Ə.Sabir. *Ayrım qızı Kərim babanın da getdiyini, naxırın başsız qaldığını bilmişdi*. A.Şaiq.

4. Azğın, önüalınmaz, qabağıalınmaz. [Elçin:] *Başsız axan suları özümüzə tabe etsək də, hələlik göylərə gücümüz çatmır*. Z.Xəlil.

**BAŞSIZ-AYAQSIZ** *sif.* Rabitəsiz, məntiqsiz. *Başsız-ayaqsız sözlər.*

**BAŞSIZLIQ** *is.* 1. Ağılsızlıq, giclik, düşüncəsizlik.

2. Sahibsizlik, yiyəsizlik, böyüksüzlük.

3. Qarışıqlıq, nizamsızlıq, hərc-mərclik. // İtaətsizlik.

**BAŞTAXTASI** *is.* Qəbrin baş tərəfində qoyulan ağac nişangah.

**BATAQ** *is.* 1. Lığ, lehmə, palçıq; lehməlik, palçıqlıq. *Araba getmədi əsla qabağa; Deyəsən batmış idi bir batağa.* A.Səhhət.

2. *məc*. Durğunluq, hərəkətsizlik, ətalət, təşəbbüssüzlük mənasında.

**BATAQLAŞDIRILMA** "Bataqlaşdırılmaq"dan *f.is.*

**BATAQLAŞDIRILMAQ** *məch.* Bataqlıq hala salınmaq.

**BATAQLAŞDIRMA** "Bataqlaşdırmaq"-dan *f.is.*

**BATAQLAŞDIRMAQ** *f.* Bataqlıq hala gətirmək, bataqlaşmasına səbəb olmaq. *Çoxlu su buraxıb, küçəni bataqlaşdırmaq.*

**BATAQLAŞMA** "Bataqlaşmaq"dan *f.is.*

**BATAQLAŞMAQ** *f.* Bataqlıq halına gəlmək, bataq olmaq.

**BATAQLI** *sif.* Palçıqlı, lehməli, zığlı. *Bataqlı küçələr düzəlib, gecələr elektrik ilə işıqlanırdı.* S.S.Axundov.

**BATAQLIQ** *is.* Durğun su, lığ, lehmə, palçıq ilə örtülü yer; bataq çox olan yer. *Küçənin ortası hər zaman bataqlıq və palçıq olurdu.* S.Rəhman. [Nəbi kişi:] *Bax, bura əlli hektardan artıq bir yerdir. İki il qabaq bataqlıqdan çıxarmışıq.* S.Rəhimov. *Kür qırağındakı geniş bataqlıq çoxdan qurudulmuşdu.* M.Hüseyn.

**BATALİ́ST** [*fr.*] Hərbi mövzuda şəkillər çəkən rəssam.

**BATALYÓN** [*fr.*] Bir neçə rotadan (bölükdən) ibarət hərbi hissə. *Batalyon komandiri. Tank batalyonu. – Komandanlığın əmrinə görə, bizim batalyon düşmənin məftil hasarını kəsməli və puç etməlidir.* Ə.Vəliyev.

**BATARÉYA** [*fr.*] Bir neçə top və minaatandan ibarət taktik vahid. *Tapdıq söhbətə .. minasaçan batareyasını susdurmağa necə getdiyindən başladı.* Ə.Əbülhəsən.

2. Bu hissənin yerləşdiyi istehkam. *Dəmir-beton özül üstündə qurulmuş batareya.*

3. *fiz.* Bir-birinə bənd edilmiş bir neçə akkumulyator, yaxud qalvanik element. *Elektrik batareyası. Akkumulyator batareyası.*

4. Buxar ilə qızdırılan binaların içində qoyulan və içərisində isti su olan bir-birinə yapışıq borular sistemi.

**BAT-BAT** *is. bot.* Bəngotu; pis qoxulu acı dadan ot bitki (*xalq təbabətində işlədilir*). *Gödək saplaqlı yaşıl rəngli və yumurtayaoxşar zəhərli otların, məsələn, bat-batın çiçəyindən olan bal da zəhərli olur.* H.Zərdabi. *Bat-bat 0,5-1 m hündürlükdə yaşıl rəngli, şirəli, çılpaq və haça qol-budaqlı gövdəyə malik .. birillik bitkidir.* Əliyev.

**BATDAQ** b a x **bataq.** *Yağışlı bir gündü. Batdaq dizə çıxırdı.* Mir Cəlal.

**BATI** *is. məh.* Günbatan tərəf, qərb. *Batı küləyi.*

**BATIQ** *sif.* 1. Çuxura düşmüş, dərinə düşmüş, çökmüş. *Batıq ordlar. Batıq göz.* – [Fərmanın] *sinəsi batıq, sifəti saralıb, çiyinləri qalxıb.* Ə.Haqverdiyev. [Rüstəm:] *Qoy onun* [Nübarın] *o quyuya düşmüş batıq gözləri lap kəlləsinə çıxsın.* S.Rəhimov.

2. Zədələnmə və s. nəticəsində bir tərəfi batmış, çökmüş, çökəklik əmələ gəlmiş. *Böyrü batıq vedrə. Yanı batıq cam. – Astanada tüstülənir böyrü batıq samovar.* S.Rüstəm. // *İs. mənasında.* Bir qədər batmış, çökmüş, çuxura düşmüş yer. *Vedrənin batığı. Ordun batığı.*

3. Boğuq, batmış. *Batıq səs. – Qoy hələ Salman çəksin, – deyə Aslan yarımçıq və batıq bir səslə Qulam müəllimə cavab verdi.* S.Rəhimov. [Ərbabın] *batıq səsi eşidildi.* Mir Cəlal.

4. Bulaşıq, bulaşmış, çirkli, bir şeyə batmış. *Batıq qab. Batıq boşqab.*

**BATIQLIQ** *is.* 1. Batıq, çökük, batmış şeyin halı.

2. Bulaşıq, bulaşmış şeyin halı.

**BATIRILMA** "Batırılmaq"dan *f.is.*

**BATIRILMAQ** "Batırmaq"dan *məch.*

**BATIRMAQ** *f.* 1. Sancmaq, girdirmək, soxmaq, keçirmək, daxil etmək (ucu iti şeyi). *İynə batırmaq. Sancaq batırmaq.*

2. Qərq etmək, suyun dibinə çökdürmək, cumdurmaq. *Qayığı az qala çevirib batırmışdı.*

3. Məhv etmək, yox etmək, zay etmək, puç etmək, itirmək. *Var-yoxunu batırmaq.* – [Ərbab:] *Qorxuram ki, mayanı batırasan.* Mir Cəlal. // *məc*. Ölməsinə, qırılmasına, tələf olmasına səbəb olmaq. *Bütün mal-qaranı*

*batırdı. Düşmən bu döyüşdə bütün qalan qoşunlarını batırdı.*

4. Mayenin içərisinə soxmaq, islatmaq, yaş etmək, hopdurmaq. *Çörəyi bala batırıb yemək.*

5. Bulamaq, bulaşdırmaq, ləkələmək, çirkləndirmək. *Üst-başını batırmaq. Ayaqqabılarını palçığa batırmaq.*

6. Bir sıra isimlərə qoşularaq, mürəkkəb feil və ifadələr düzəldilir; məs.: *ad batırmaq, başını batırmaq.*

**BATIŞ** *is*. Batma. [Vaqif:] *Günəşin çıxışı ilə batışı gözəl olur, günorta yerində olanda ona heç baxan da olmur*. Çəmənzəminli.

**BATİL** *sif.* [*ər.*] *köhn.* 1. Yalan, əsilsiz, doğru olmayan, həqiqətə uyğun olmayan. *Batil fikir*. // İs. mənasında. *Madam ki, xalq elm səbəbi ilə haqq ilə batilə fərq verməyə qabil deyil, gündə bir şeyx .. çıxacaq, aləmə fitnə salacaq .. və bədbəxt edəcək.* M.F.Axundzadə. *Biz burada istər Bab, istərsə Bəhanın anadan alim doğulduqları iddiasının batil olduğunu təyin etdik.* M.S.Ordubadi. ☐ **Batil eləmək (etmək)** – puça çıxarmaq, heçə çıxarmaq, heç eləmək, batırmaq. *Mən gözlərimə inana bilmirəm, bu imarət kimindir, burada tikilibdir? Bu mənim imarətimi batil elədi.* (Nağıl). *Hərdənbir zurnanın səsi ucalıb, özgə səslərin hamısını batil eləyirdi.* C.Məmmədquluzadə.

2. Dinə görə doğru olmayan, dinin tələblərini və göstərişlərini, hökmünü, şərtlərini pozan (iş, hərəkət və s.). *Dayım namazda olanda çün danışa bilməzdi ki, namazım batil olmasın.* C.Məmmədquluzadə. [Salmanov:] *Sən nə danışırsan, ay oğul, məni günaha batırıb ibadətimi batilmi eləmək istəyirsən?* M.Hüseyn.

**BATİN** *is*. [*ər.*] Daxil, iç, iç üz (*zahir* ziddi). *Zahida, gəl soyunaq bir kərə paltarımızı; Çıxaraq zahirə batindəki əfkarımızı.* M.Ə.Sabir. *Batinin əksidir fəqət zahir*. H.Cavid. *Zahirən çox sadəlövh görünən bu qızın batində bu qədər hiyləgər olduğuna Əlyarov heç vəchlə inana bilmirdi*. M.Hüseyn. // Gizli. [Fərraşbaşı:] *Bəli, batində o da Ağa Mərdanın şəriki imiş!* M.F.Axundzadə. *Bir qismi də batində dinsiz, amma zahirdə özlərini camaatın nəzərində dindar qələmə verən oxumuşlarımızdır*. C.Məmmədquluzadə.

**BATİNƏN** *zərf* [*ər.*] Daxilən, içdən, ürəkdən. *Mən batinən çox məmnun qaldım və hətta haqqından savayı bir abbası da artıq verdim.* C.Məmmədquluzadə. [Erkək Tükəzban] *batinən ağıllı bir türk qadınıdır.* B.Talıblı.

**BÁTİNİ** *sif.* [*ər.*] Daxili, iç (*zahiri* ziddi). *Bu adamın zahiri quruluşu kimi, batini həyatının da çox maraqlı olduğunu onun* [Əzim dayının] *hər sözündən, hər hərəkətindən anlamaq olurdu.* A.Şaiq. // Mənəvi.

**BATÍST** [*fr.*] Nazik və bir qədər parlaq pambıq parça növü.

**BATQI** *is*. 1. Zəlzələ nəticəsində yerdə və dağlarda əmələ gələn batıqlıq, çöküntü.

2. Alverdə və s.-də itki, ziyan, zərər.

3. Dənizdə və s.-də batmış gəmi və s.

**BATQIN** *sif.* 1. Batmış, çökmüş, çökək, çuxura düşmüş. *Qubernator, adı çəkildiyindən batqın gözlərini bir çocuq sevinci ilə parıldadan Cəfər əmidən: – Siz necəsiniz? –* [deyə soruşdu] H.Nəzərli. // Çuxur, dərin yer.

2. Batıq, batmış (səs).

3. *məh.* İtmiş, adı və nişanı qalmamış. *Adı batqın.* ☐ **Batqına düşmək** – vaxtında gəlib çıxmamaq.

4. *məh.* İflas etmiş, müflis.

**BATQINLIQ** *is*. Çökək və batmış şeyin halı; çökəklik, batıqlıq. // Çuxurluq, dərinlik.

**BATMA** "Batmaq"dan *f.is.*

**BATMAQ** *f.* 1. Şiş tərəfi ilə bir yerə sancılmaq, girmək, soxulmaq (ucu iti şeylər haqqında). *Ayağıma mıx batdı. Barmağıma iynə batdı. – Tikan olub ayağa batınca, gül ol yaxaya sancıl.* (Ata. sözü). // *məc*. Batan kimi, girən kimi hiss olunmaq; sancmaq. *Gözümə elə bil bir şey batır. Qulağıma sanki bir şey batıb. – Müctəhidzadənin bu sözləri sanki iynə olub ürəyimə batdı.* M.S.Ordubadi.

2. Suyun dibinə dalmaq, cummaq, düşmək. *Suya batıb çıxmaq. Dalğıc suya batıb gözdən itdi. Ağac sudan yüngül olduğu üçün batmır. Vedrə suyun dibinə batdı*. // Qərq olmaq, suda boğulmaq. *Barkas tufana düşdü və dərhal batdı. Balıqçıların hamısını qurtardılar, amma balıqları batdı.* // Yapışan, özlü, qəliz, qatı bir şeyin içinə girib çıxmamaq. *Araba getmədi əsla qabağa; Deyəsən batmış idi bir batağa.* A.Səhhət. // *məc. dan.*

Bir şeyin həddindən artıq çoxluğunu göstərir. *İşin içində batmaq. Kağızların içində batmışam, çıxa bilmirəm. Borca batmaq.*

3. Örtülmək, bir şeyin altında, yaxud arasında qalıb görünməmək, görünməz hala gəlmək, itmək. *Taxıl o qədər hündürdür ki, adam arasında batır. Xırda daxmalar meşənin içində batıb gedir. – Yaylaq deyib ellər dağa köçəndə; Gül-çiçəyə tamam batar o dağlar.* H.K.Sanılı. *Bütün kainat qar altında batmış kimi idi.* Mir Cəlal. *Dağüstü şəhəri qaranlıq içində batıb gedirdi.* S.Rəhimov.

4. Qürub etmək, gözdən itmək. *Gün batdı.* – [Dost] *sənə cavab vermədən əvvəl səndən soruşur ki, günəş saat neçədə batır.* M.F.Axundzadə. *Axşamdır, gün batmış, şəfəq saralmış; Çölə zülmət çökmüş, hava qaralmış.* A.Səhhət. *Günəş artıq batmaq üzrə idi.* S.Rəhman.

5. Məhv olmaq, zay olmaq, puç olmaq, heçə çıxmaq, hədər getmək, yox olmaq. *Bütün qoyduğum əmək batdı. Bütün günüm batdı. Onun bütün pulları batdı.* // Əldən çıxmaq, itmək. [Zibeydə:] *Ağa Həsənə getməsən, bilirsənmi ki, altmış min tümən batar?* M.F.Axundzadə. [Nəcəf bəy:] *Nə vaxt sənin məndə iki quruşun batıbdır ki, gənə batsın.* Ə.Haqverdiyev. // İflas etmək, müflis olmaq, heç bir şeyi qalmamaq. // *məc.* Ölmək, qırılmaq, tələf olmaq, məhv olmaq. *Bütün mal-qara batdı.* – [Ocaqqulu:] *Sən öl, Vəliyulla, ev yiyəsinə qalsa, adam acından batar.* S.Rəhimov.

6. Yox olmaq, yerlə bir olmaq, məhv olmaq. *Zəlzələdən bütün şəhər batdı. – .. İnqilab günlərində qarışqa yuvası kimi qaynaşan küçələr indi zəlzələdən batmış kimi susub durmuşdur.* M.S.Ordubadi.

7. Çökmək, çuxura düşmək. *Ordları batmaq. Gözləri batmaq. – Pinəçi* [Səriyyə xalaya] *ordları batmış, yarpaq kimi saralmış və arıqlamış Ayazı və Niyazı göstərdi.* M.İbrahimov.

8. Əsəri, izi, nişanəsi qalmamaq, yox olub getmək. *Adı batmaq. İzi batmaq.*

9. Bulaşmaq, bulanmaq. *Palçığa batmaq. Kağız mürəkkəbə batıbdır. – Üstüm-başım qana və qanlı torpağa batmışdı.* M.S.Ordubadi. [Qəhrəman] *alınan, bölünən və göndərilmək üçün bağlanan dərs kitablarının tozuna batır.* S.Rəhimov. // Başdan-başa örtülmək, basmaq. *Cütçü batıb qan-tərə, yer şumlayır; Şumladığı torpaqları tumlayır.* M.Ə.Sabir.

10. Tutulmaq. *Səsi batmaq. Qulağı batmaq.*

11. *məc. dan.* Qalib gəlmək, üstün gəlmək, gücü çatmaq. *Hətta nikolaylara batan olubsa da, fazillərin sözünü danışmağa bir kimsə cürət eləməyib.* C.Məmmədquluzadə. ☐ **Bata bilməmək** – qalib (üstün) gələ bilməmək, gücü çatmamaq. *Xanın adamları həramilərə bata bilmədi.* (Nağıl). *Qoşun nə qədər hər tərəfdən hücum etdisə, dəlilərə bata bilmədi.* "Koroğlu". [Bədəl:] *Bizə bu dağların arasında heç bir qüvvət bata bilməz.* Ə.Haqverdiyev.

12. *məc.* Təsir etmək. *Bu uşaqlara heç bir söz batmır. – Neyləyəsən, xalqa sözün batmadı; Hiylələrin bir kəsi aldatmadı.* M.Ə.Sabir.

13. Bir sıra isimlərə qoşularaq, mürəkkəb feillər və müxtəlif ifadələr düzəldilir; məs.: ağlına batmaq, beyninə batmaq, günaha batmaq.

◊ **Batıb çıxmaq** – gah görünmək, gah yox olmaq. *Axşam buludlar arasında batıb çıxan ayın işığında on altı atlı .. arana doğru enməyə başladı.* Çəmənzəminli. **Batıb qalmaq** *məc.* – çıxa bilməmək, tamamilə ilişib qalmaq, çıxılmaz vəziyyətə düşmək.

**BATMAN** *is.* Azərbaycanın müxtəlif yerlərində müxtəlif ağırlıqda (*əsasən 20 girvənkə ağırlığında*) olan köhnə çəki ölçüsü. [Hacı Kərim:] *Bir misqal ondan bir batman misə vurur, xalis gümüş olur.* M.F.Axundzadə. *Əhli-xibrə qoydular qan-tarə şahi çəkdilər; Əlli batman istixani gəldi, yüz batman əti.* M.Möcüz. *Qazanın hər biri sözsüz dörd-beş batman düyü çıxaran qazandı.* M.S.Ordubadi.

◊ **Ağır oturub, batman gəlmək** – vüqarlı olmaq, ağır olmaq, ciddi olmaq. *Ağır otur, batman gəl.* (Ata. sözü). **Özünü batman hesab eləmək** – özü haqqında çox böyük fikirdə olmaq. [Ağa Kərim:] *Rədd ol! Ədə Xalıq, .. gəl buna göstər ki, çetvərdir, özünü batman hesab eləməsin.* S.Rəhimov.

**BATMANLIQ** *sif.* Bir batman çəkisində olan; bir batman tutumunda olan; bir batman tutan. *Batmanlıq yük. Batmanlıq qazan. – Üçüncü gün səhər açılan kimi, on batmanlıq daş atan mancanaqlar Siyahdəhən, Şal və Soniqan məntəqələrini döyməyə başladı.* M.S.Ordubadi. [Şeyda:] *Öz unumuzdandır; bir batmanlıq yerimiz var, onu hər il əkirik.* A.Şaiq.

**BATMAN-TƏRƏZİ** *is.* 1. Ağır şeyləri çəkməyə məxsus böyük tərəzi; qapan.

2. B a x **basqıncaq**.

**BATMIŞ** 1. "Batmaq"dan *f.sif.*

2. *is.* Söyüş, qarğış, təhqir mənasında. [Sənəm:] *Yəni batmış* [Məşədi İbad] *o qədər çirkindir ki, adam qorxa da bilər?* Ü.Hacıbəyov.

**BAVƏR** [*fars.*]: **bavər etmək (qılmaq)** – inanmaq. *Məcnun ilə Leylini bərabər; Gər kim deyir isə, qılma bavər.* Füzuli. *Gürcüstanda onun* [qızın] *nəqlinə bavər etməyib belə fərz edirdilər ki, guya o qaçıbdır və istəyirdilər ki, onu geri qaytarsınlar.* M.F.Axundzadə. *Evi yandı yalançının, – derlər; Ona bir kimsə etmədi bavər.* M.Ə.Sabir. *Ağanın xüsusi məvacibxor agentləri hər yeri dolanıb, belə xəbəri buraxırdılar və avam xalq da bu agentlərin sözlərinə bavər edirdilər.* Ə.Haqverdiyev.

**BAY**[1] *sif. qəd.* Dövlətli, zəngin, varlı, bəy; böyük. *Bay ilə yoxsul bənəm, yolçu ilə yol bənəm.* Nəsimi. *Ey xublar içində tələti-hüsn ilə bay olan!* Xətayi. *Budu xahişləri kim, baxmayıb ağü bozuna; Eyləyim həcv bayü gədavü xanı.* Q.Zakir. *Sənsən mahal yaraşığı; Göz görməz sənsiz işığı; Müxtəsər ki, heç aşığı; Eyləməzsən bay, qara qız.* Aşıq Ələsgər.

**BAY**[2] *nida.* Təəccüb, heyrət, çaşqınlıq və s. hissləri bildirir. *Bay! Sən hara, bura hara! Bay! Bu kimdir? Bay, haçan gəlmisən? – Bir az suyu* [gölməçədə] *araşdırmışdıq ki, Məmmədağa səsləndi: – Bay, balıq əlimə dəydi. – Hanı, hanı? – deyə mən də onun yanında axtarmağa başladım.* S.S.Axundov. // Bəzən təkrar şəklində işlənir.

**BAYAĞI** *sif.* 1. Ən adi, ən sadə, çox bəsit; çeynənmiş. *Bayağı fikir.*

2. Qaba, şit, ləyaqətsiz. *Bayağı zövq. Bayağı söz* (*ifadə*).

**BAYAĞILAŞDIRICI** *is.* Bir nəzəriyyəni, fikir və s.-ni təhrif olunacaq dərəcədə sadələşdirən, qabalaşdıran, bayağı şəkildə göstərən adam. *Marksizmi bayağılaşdırıcılar.*

**BAYAĞILAŞDIRICILIQ** *is.* Bayağılaşdırma işi.

**BAYAĞILAŞDIRILMA** "Bayağılaşdırılmaq"dan *f.is.*

**BAYAĞILAŞDIRILMAQ** *məch.* Təhrif olunacaq dərəcədə sadələşdirilmək, bəsitləşdirilmək, qabalaşdırılmaq; bayağı şəkildə göstərilmək. *Müəllifin fikri bayağılaşdırılmışdır.*

**BAYAĞILAŞDIRILMIŞ** *f.sif.* Təhrif olunacaq dərəcədə sadələşdirilmiş, bəsitləşdirilmiş, qabalaşdırılmış; bayağı şəklə salınmış. *Bayağılaşdırılmış nəzəriyyə.*

**BAYAĞILAŞDIRMA** "Bayağılaşdırmaq"-dan *f.is.*

**BAYAĞILAŞDIRMAQ** *f.* Təhrif olunacaq dərəcədə sadələşdirmək, bəsitləşdirmək; bayağı şəkildə göstərmək. *Nəzəriyyəni bayağılaşdırmaq.*

**BAYAĞILAŞMA** "Bayağılaşmaq"dan *f.is.*

**BAYAĞILAŞMAQ** *f.* Təhrif olunacaq dərəcədə sadələşmək, bəsitləşmək; bayağı şəklə düşmək.

**BAYAĞILIQ** *is.* Bayağı şeyin halı. *Fikrin, ifadənin bayağılığı.*

**BAYAQ** *zərf* Bir az bundan əvvəl, qabaqca. [Qaraca qız:] *Mən bayaq çəpərin arasından güllü bağçaya baxırdım, sən də kitab oxuyurdun.* S.S.Axundov. *Əsəd sıçrayıb bir daşın dalında gizlənərək, bayaq gördüyü yerə baxmağa başladı.* B.Talıblı. [Musa kişi:] *Mən bayaq fikir verirdim, sən uşaqlara baxanda tikə boğazından aşağı getmirdi.* M.İbrahimov.

**BAYAQDAN** *zərf* (bəzən "bəri" sözü ilə bərabər). Bir az əvvəldən; çoxdan. *Bayaqdan dayanıb səni gözləyirəm. – Bir səs gəlir uzaqdan; Mən dinlərəm bayaqdan.* A.Səhhət. *Bayaqdan bəri gözlərini yumub mürgüləyərək qulaq asan .. Hikmət İsfahani əqrəb çalmış kimi dik atıldı.* M.İbrahimov. *Yağış ara verəndə atları mindik. Bayaqdan canavar ağzını açıb üstümüzə yüyürən itlər indi səf çəkib sakit dayanmışdılar.* R.Rza.

**BAYAQKI** *sif.* Bir az əvvəlki, bir az əvvəl olmuş. [Şahnisə xanım:] *Tanrının qüdrətinə şükür! Bayaqkı tufan, indiki gözəlliyə bax!* Çəmənzəminli. *İzi də qalmamışdır, bayaqkı yorğunluğun*. R.Rza. *Sükutu Əziz pozub, Gülsabahın bayaqkı eyhamlı suallarına cavab verməyə başladı*. Ə.Vəliyev.

**BAYÁN** [*rus.*] Mürəkkəb quruluşlu böyük qarmona bənzər musiqi aləti. *Bayan çalmaq. – Nəfəsli musiqi alətləri əsas etibarı ilə üç qrupa ayrılır: ..Klavişli musiqi alətləri* (*ərğənun, qarmon, fisqarmoniya, bayan, akkordeon və sairə*). Ə.Bədəlbəyli. *Əvvəl günlər Salovyova elə gəlirdi ki, .. kamançanın incə, lirik ahəngi bayanın gur səsini korlayır.* Ə.Əbülhəsən.

**BAYANÇALAN, BAYANÇI** *is*. Bayan çalan çalğıçı.

**BAYAT** *sif.* 1. Köhnəlmiş, təzəliyini itirmiş; köhnə, quru, soyuq. *Bayat çörək. Bayat xörək. Bayat aş. – Hərdən arvadın əlacı kəsilib, gedib Ələsgər ağagildə qulluq edirdi və axşamlar uşaqlara çörək qurusundan, bayat bişmişlərdən gətirirdi.* Çəmənzəminli.

2. *məc*. Dəbdən düşmüş.

**BAYATI** *is*. 1. Azərbaycan xalq musiqisində həzin bir hava adı. *Bayatı çəkmək* (*demək*). *– Külli Qarabağın abi-həyatı; Nərmü nazik bayatıdır, bayatı*. M.V.Vidadi. [Novruzun] *bayatıları Bahadırın dərdini daha da artırırdı.* N.Nərimanov. *..Çoban da bayatı nəğməsini tütəyində ucaltdı*. S.S.Axundov. *Anasından ayrılandan sonra Əbdülkərim bir bayatı çağırmağa izin istədi.* Ə.Haqverdiyev. ◻ **Bayatı-qacar, bayatı-əcəm, bayatı-isfahan, bayatı-kürd, bayatı-şiraz** və s. – klassik Azərbaycan musiqisində muğam adları. *Ağayi Füzulüzzakir .. neçə dəfə bizim üçün öz segahları ilə, şurları ilə, xüsusən bayatı-qacarları ilə ləzzəti-ruhani veribdir.* Ə.Haqverdiyev.

2. Azərbaycan şifahi xalq ədəbiyyatında nəzm formalarından biri; çox zaman onun dörd misrasından 1, 2 və 4-cüsü həmqafiyə, 3-cü misrası isə sərbəst olur; məs.: *Bu bağça bar olunca; Heyvalar nar olunca; Çatlayır dəli könlüm; Sən mənə yar olunca.*

**BAYATILAMAQ** *f.* Bayatı söyləmək, bayatı çağırmaq. *Əfruzun laylası qarlı pəncərəni dilləndirirdi. Mədəd qapıdan girərək: – Nə bayatılayırsan? – deyə soruşdu və kitablarını stolun üstünə qoydu*. S.Rəhimov.

**BAYATIMA** "Bayatımaq"dan *f.is.*

**BAYATIMAQ** *f.* 1. Bayat olmaq, köhnəlmək, təzəliyini, təravətini itirmək (çörək, xörək və s. haqqında). *Xörək bayatımışdır, yemək olmur.*

2. *məc. dan.* Qiymətdən düşmək, dəyərsizləşmək, əhəmiyyətini itirmək.

**BAYATLAŞMA** "Bayatlaşmaq"dan *f.is.*

**BAYATLAŞMAQ** *f.* 1. Köhnəlmək, qalıb təravətini, təzəliyini itirmək. *Xörək bayatlaşmışdır*.

2. *məc.* Dəbdən düşmək, daha işlənməmək.

**BAYATLIQ** *is*. Bayaq şeyin halı. *Çörəyin bayatlığı.*

**BAYAZ** *is*. [*ər.*] 1. Bax **bəyaz** 1-ci mənada.

2. *köhn.* Şeir, mərsiyə dəftərçəsi. *Bayazımı açıb, Qarabağ səpgisində bir mərsiyə oxudum. O gecədən etibarən məndən əl çəkmədilər*. H.Sarabski.

**BAYDA** bax **badya**. *..Səhərlər çayın yanına yekə bayda dolusu qaynar süd gələndə "oğru inəyin" südü, deyib danışırlar.* C.Məmmədquluzadə.

**BAYDIRMAQ** *f. məh.* Özgədən alınan əmanəti sahibindən izinsiz olaraq başqasına vermək.

**BAYĞIN** *sif.* və *zərf* 1. Özündən getmiş, qəşş etmiş, ürəyi keçmiş, bayılmış. *Bayğın düşmək. Bayğın kimi yatmaq. – Səfər bu səsə əhəmiyyət vermədi, bayğın gözləri sayrışan ulduz arasında dolaşırdı.* Çəmənzəminli.

2. *məc.* Xumar, məstanə, süzgün. *Bayğın baxışlar. – Qadınların bu hərəkəti, Almazın dalğın duruşu, bayğın baxışları, gizli göz yaşları Pakizəni heç açmırdı.* A.Şaiq.

**bayğın-bayğın** *zərf* Xumarlanmış halda, süzgün-süzgün, məstanə. [Gənc oğlan və qız] *bu kölgəli gecəni bayğın-bayğın seyr edir və ürəklərinə yaxın olan şeylərdən danışırlar*. M.S.Ordubadi.

**BAYĞINLIQ** *is.* Özündən getmiş, qəşş etmiş, ürəyi keçmiş adamın halı; özündən getmə, qəşş etmə, ürəyi keçmə. *Ayna onu sarmış ani bir bayğınlıqdan ayılaraq, ağacdan ayrıldı.* Ə.Məmmədxanlı.

**BAYĞIRMAQ** *f.* Bağırmaq, qışqırmaq, hayqırmaq. [Şirəli] *özünün son qüvvətini toplayaraq bayğırırdı*. M.Hüseyn.

**BAYILDICI** *sif.* Bihuşedici, məstedici, valehedici. *O dalğın və müəmmalı gözlər gecənin sükutunu oxşayan müzəyyən və bayıldıcı bir ud zümzüməsini dinləyərək uyuyur*. H.Cavid.

**BAYILMA** "Bayılmaq"dan *f.is.*

**BAYILMAQ** *f.* Özündən getmək, qəşş etmək, ürəyi keçmək. *Bayılmaq dərəcəsinə gəlmək.* – [Balaş:] *Sağdır, sağdır, ürəyi döyünür, ancaq bayılmışdır*. C.Cabbarlı. *"Anamız öldü, aman!" – deyib, birdən bayıldım.* S.Rüstəm.

**BAYILMIŞ** *f.sif.* Özündən getmiş, qəşş etmiş. *Burjuylar bayılmış qadınlarını faytona qoyub qaçmaq istəyirdilər*. M.S.Ordubadi.

**BAYILTMAQ** *icb*. Bayılmasına səbəb olmaq. [Əkbər] *yerişi ilə nişanlayan, kirpiyi ilə oxşayan, baxışı ilə bayıldan .. xanımlar görməmişdi.* Mir Cəlal. *Sonra ikinci zərbə, üçüncü zərbə Hüseyni bayıltdı*. S.Rəhman.

**BAYIR** *is*. 1. Binanın və s.-nin xarici; eşik, həyət, çöl, dişarı, kənar, açıq yer. *Bayırda qar yağır. Bayırda hava necədir? İndicə bayırdan gəldi. Bayırdan musiqi səsi gəlir. Uşaqlar bayırda oynayırlar. – Şəhabəddin Xədicəni bayıra çağırıb, ərinin atlı-arabalı dərəyə uçub ölməyini xəbər verdi*. S.S.Axundov. *Bayırda bərk xəzri əsirdi.* M.İbrahimov. *Onların hər ikisi pəncərədən bayıra baxdı*. Ə.Sadıq. ☐ **Bayıra atmaq (basmaq)** *dan.* – qovmaq, çıxarmaq. *O katibi birdəfəlik bayıra atmaq lazımdır*. S.Rəhimov.

2. *dan.* Üz, zahir, xarici görünüş. *İçərim özümü yandırır, bayırım özgəni*. (Ata. sözü).

3. Adətən "sayır-bayır" şəklində *dan.* – boş, hədərən-pədərən, rabitəsiz, mənasız. *Sayır-bayır danışmaq. Gecə-gündüz sayır-bayır danışırdım*.

**BAYIR-BACA(Q)** *is.* Çöl, bayır, ümumiyyətlə, hər hansı bir yer. *Pəri xanım kəndli qızı idi, necə olmuş olsa da, gənə bayır-bacaq görmüşdü.* (Nağıl). [Cəfər əminin] *əynindəki həmişəlik iş paltarından başqa bircə dəst bayır-bacaq paltarı var idi*. H.Nəzərli. *Bəlkə elə bayır-bacaqda Allahqulu kimilərin ağzına dil verən də Veysdi?* Ə.Əbülhəsən. // Həyət, evin ətrafı. *Qapı-bacanı əhənglə ağartmaq, evlərin bayır-bacağını süpürmək .. ümumi bir həvəs idi.* H.Sarabski.

**BAYIRŞƏHƏR** *is. dan.* Şəhərin bürcündən xaric, yaxud əsas çevrəsindən kənarda olan hissəsi.

**BAYIRŞƏHƏRLİ** *sif.* və *is. dan.* Bayırşəhərdə yaşayan. [Bayırşəhərdə yaşayanlara] *ayaqyalın bayırşəhərli deyərdilər*. H.Sarabski.

**BÁYKA** *is.* [*rus.*] 1. Yundan və ya pambıqdan toxunan yumşaq xovlu parça.

2. Bu parçadan tikilmiş. *Bayka palto.*

**BAYQU** *is*. Bayquş sözünün qədim forması. *Bayqu gələr, məskən salar sənə, yar; Sən hurisən, sən pərisən mənə, yar*. Aşıq Mehdi. *Yığıldı bayqular, etdi viranə; Ömür oldu yaman yarı, sevgilim!* Aşıq Rəcəb. *Qeyr ilə yarım gedir, gərdən çəkib bir qu kimi; Qalmışam viranələr küncündə mən bayqu kimi*. S.Ə.Şirvani.

**BAYQUŞ** *is*. 1. İri gözlü, girdə başlı, çirkin səsli, qarmaqburun, yırtıcı gecə quşu. *Bayquş xərabəlik, qurd dumanlıq sevər.* (Ata. sözü). *Axşamtərəfi yağış havası, bayquş da ulayır.* Ə.Haqverdiyev. *Qəflətən bir qorxulu səs meşəni götürdü. Faytonçu dedi: – Qorxma, xanım, bayquşdur, ulayır*. S.S.Axundov.

2. Mənhusluq, uğursuzluq simvolu kimi. [Gülnaz] *bayquş kimi həyatlərinə kədər və qüssə gətirmiş bu adamların yaxasından tutub, çölə atmaq .. istəyirdi.* M.İbrahimov. *Nə etmək ki, hökmdarlar bayquşu bülbüldən çox sevirlər*. M.Hüseyn. ☐ **Bayquş yuvası** *məc.* – xarabazarlıq, əhalisi tərk olmuş yer; mənhus yer, şükümsüz yer. *Bir neçə ildən sonra* [qoçuların] *sayəsində Zabrat kəndi bayquş yuvasına döndü.* H.Sarabski. [Maral:] *Ah,* [bu] *bayquş yuvasından qurtula bilsəydim*. H.Cavid.

3. *məc*. Cəmiyyət sevməyən, insanlardan qaçıb təkcə yaşayan adam haqqında. *O lap bayquşdur, adam arasında görünmür. Bayquş kimi həyat keçirmək.*

**BAYRAQ** *is*. Uzun və nazik bir ağacın baş tərəfinə rəbt edilmiş və adətən üzərində dövlətin, yaxud hərbi və ya ictimai təşki-

latın xüsusi əlaməti – nişanı çəkilmiş bir və ya müxtəlif rəngli qumaş parçası. *Parlaman üstündə üçrəngli bayraq; Çarpırdı ruzgara dalğalanaraq.* M.Müşfiq. *O gün olsun bu göy bayraq Turan üstə açılsın.* C.Cabbarlı.

◊ **Ağ bayraq qaldırmaq** – təslim olmağa hazır olduğunu bildirmək. **...bayrağı altında** – bir şey naminə, bir şüar altında, bir məqsəd uğrunda, bir qayəni əldə rəhbər tutaraq. **Mübarizə bayrağı qaldırmaq** – mübarizəyə qalxmaq. ...**bayrağını yüksək tutmaq** – hər hansı bir ideyanı, vəzifəni namusla, layiqincə yerinə yetirmək.

**BAYRAQÇI** bax **bayraqdar.**

**BAYRAQDAR** *is.* Bayraq tutan, bayraq daşıyan adam. *Bu qadınlar dəstəsinin başında duran bayraqdar, ucaboylu .. qoca bir qadın idi.* S.S.Axundov. [Əjdər] *bayraqdar olduğuna fərəhlənir və bu bayrağı ona tapşırdıqları üçün sevinirdi.* S.Rəhman.

**BAYRAQDAŞIYAN** bax **bayraqdar.** *Bayraqdaşıyanlar .. bayrağı möhkəm tutmuşdular.* M.S.Ordubadi.

**BAYRAQLI** *sif.* Bayrağı olan, əlində bayraq olan. *Bayraqlı əsgərlər.* // İs. mənasında. *Bayraqlılar qabaqda gedirlər.*

**BAYRAM** *is.* 1. Hər hansı bir tarixi və s. hadisə şərəfinə keçirilən şadlıq günü; təntənə. *Bir May bayramı. Oktyabr bayramı.* – [Qolçomaqlar] *heç vaxt qəbul eləməzdi ki, qadınlar başıaçıq meydanlara çıxıb, bayram saxlasınlar.* Ə.Haqverdiyev. ☐ **Bayram axşamı** – hər hansı bir bayramdan əvvəlki gün. **Bayramınız mübarək (olsun)!** – bayram münasibəti ilə təbrik.

2. Şadlıq, şənlik, xoşbəxtlik, səadət mənasında. *Vəsli-yar ilə yetişdi hamı bayrama, könül! Yetmədin dövləti-dildar ilə sən kamə, könül!* S.Ə.Şirvani.

3. Kütləvi oyunlar, əyləncələr və s. keçirilən gün. *İdman bayramı. Yaz bayramı. Uşaq bayramı.*

◊ **Qara bayram** – bax **qara[1].**

**BAYRAMQABAĞI** *sif.* və *zərf* Bayrama yaxın, bayram ərəfəsində olan. *Bayramqabağı ticarət. Bayramqabağı yarış. Bayramqabağı hazırlıq.*

**BAYRAMQURDU** *is.* bax **məryəmqurdu**.

**BAYRAMLAŞMA** "Bayramlaşmaq"dan *f.is.*

**BAYRAMLAŞMAQ** *qarş.* Bayram münasibəti ilə bir-birini təbrik etmək, bir-biri ilə görüşmək. *Xanməmməd gəldi, bayramlaşıb oturdu.* Çəmənzəminli. *Bayramlaşmağa gələnlər yerin azaldığını görüb, xudahafizləşib gedirdilər ki, başqa gələnlər üçün yer açılsın.* H.Sarabski.

**BAYRAMLIQ** 1. *sif.* Bayrama məxsus olan, bayram münasibəti ilə düzəldilmiş. *Bayramlıq süfrə. Bayramlıq paltar.*

2. *is.* Bayram hədiyyəsi, bayram payı. [Hacı Osman:] *Balalar, əziz balalar, mən sizə bayramlıq nə verim?* N.Vəzirov.

**BAYRAMSAYAĞI** *zərf* Bayramda olan kimi. *Ülfət Yunis və Davud ilə birlikdə gerbi maşından çıxarıb, Akademiyaya bayramsayağı bəzənmiş binaya gətirəndə, eksponatlar qəbulu bitmişdi.* Mir Cəlal.

**BAYRAMYEMİŞİ** *is.* 1. Bayramlarda süfrəyə düzülən quru meyvələr və s. şirniyyat; xuşgəbar. [Novruz bayramında] *dükanların qapısı üstündən bir zəng asardılar və bayramyemişi satıldıqca o zəngi vurardılar.* H.Sarabski.

2. *məc.* Bir-birini tutmayan müxtəlif şit rənglər.

**BAYRONÍZM** [*xüs. is.*-dən] İngilis şairi Bayronun yaradıcılığı təsiri altında XIX əsrin əvvəllərində Qərbi Avropada meydana gəlmiş ədəbi cərəyan (bu cərəyanın xüsusiyyəti romantik fərdiyyətçilikdən, şair ilə cəmiyyət arasında təzaddan, ruh düşkünlüyündən ibarət idi).

**BAYTAL** bax **baytar.** [Nurcahan:] *Başına dönüm, həkimbaşı, bu suyu bir baytal verib, mənim azarlıma dava adına...* N.Vəzirov.

**BAYTAR** *is.* [*ər.*] 1. Mal həkimi. *Baytar həkim. Baytar vəzifəsi.*

2. *məc. dan. zar.* Təbabətdən xəbəri olmadığı halda, həkimlik iddiasında olan adam və ya öz peşəsini yaxşı bilməyən həkim haqqında; yalançı həkim.

**BAYTARLIQ** *is.* 1. Mal həkiminin işi, sənəti.

2. Ev heyvanları xəstəliklərinə və bu xəstəliklərin müalicə üsullarına aid olan. *Baytarlıq elmi. Baytarlıq məntəqəsi. Baytarlıq fakültəsi. Baytarlıq elmləri doktoru.*

**BAZ** *is.* [*fars.*] Alıcı quş, tərlan, qızılquş; quş ovlamaq üçün ələ öyrədilmiş quş. *Şikari*

*aşikar eylər, görün bu baz şahbazı; Könüllər seydinə yarın gözü şahanə laçındır.* Xətayi.

...**baz** [*fars.*] Bəzi isimlərin axırına gətirilərək bir şeyin həvəskarı, maraqlısı, hərisi məfhumunu ifadə edən şəkilçidir; məs.: quşbaz, sehrbaz, qumarbaz və s.

**BÁZA** [əsli *yun.*] 1. Bünövrə, əsas, özül, bina. *İqtisadi baza.* – [Sumqayıtda] *metallurgiyanın ilk bazası qoyulur.* Mir Cəlal. // Bir şeyin həyata keçirilməsi, yaxud fəaliyyəti üçün lazım olan maddi-texniki şəraitin məcmusu. *Texniki baza. Heyvandarlıq üçün yem bazası. Yüngül sənaye üçün xammal bazası yaratmaq. – Qarğıdalı eyni zamanda iki məsələni, yəni həm dən ehtiyatının artırılması, həm də mal-qara üçün möhkəm yem bazası yaradılması məsələlərini həll etməyə imkan verir.* (Qəzetlərdən).

2. Müəyyən bir işə, əməliyyata xidmət üçün hər cür ehtiyat, maddi vəsait, xüsusi təsisat və qurğularla təchiz olunmuş yer, istinad nöqtəsi. *Təyyarə bazası. Hərbi-dəniz bazası. Turist bazası.*

3. Mal, məhsul, material və s. saxlamaq üçün yer, anbar. *Neft bazası. Kömür bazası. Azərittifaqın meyvə-tərəvəz bazası. – Dairəittifaq sədri Nemətullayev əmtəə bazasında olduğundan bu səfərbərlikdən qalmışdı.* S.Rəhimov.

**BAZÁLT** [*lat.*] *geol.* Mürəkkəb tərkibli tünd rəngli, xırda dən-dən, yaxud sıx şəkildə olan vulkanik süxur (şüşə sənayesində, inşaat və s. işlərində istifadə olunur).

**BAZAR**[1] *is.* 1. Alış-veriş yeri. *Bütün şəhər bazar, dükanları bağlayıb küçələrə çıxmışdı.* M.S.Ordubadi. *Bazarın başında yoğun və qırmızıbirçək bir baqqal – "buy, dəli Səmədə bax!" deyib, ona bir çürük badımcan səlbəsi atdı.* Çəmənzəminli. *Bazarın ayağında Quba meydanı adlanan yer vardı.* S.Rəhman. ☐ **Bazar dəyəri** – rəsmi idarələr tərəfindən deyil, bazarda müəyyən edilən qiymət. **Bazara çıxarmaq** – malı satışa qoymaq, alver meydanına çıxarmaq. **At bazarı** *köhn.* – keçmişdə şəhərlərdə və ya həftə bazarlarında at satılan yer, meydança. **Quş bazarı** – ilin müəyyən fəsillərində köçəri quşların toplandığı yer.

2. Açıq yerdə, yaxud bina içərisində düzəldilən böyük mövsüm ticarəti. *Kitab bazarı. Bayramqabağı bazar. – Hər həftə şənbə günləri Güllücə kəndində bazar olardı. Kimi mal almağa və kimi də mal satmağa gələrdi.* S.S.Axundov.

3. *iqtis.* Əmtəə dövriyyəsi sahəsi, zonası. *Daxili bazar. Xarici bazar. Dünya bazarı.*

4. Alver, alış-veriş, alğı-satqı. *Bu gün bazar yoxdur.* – [Hacı Qara:] *Allah kəssin belə bazarı! Belə alış-verişi!* M.F.Axundzadə.

5. *məc. dan.* Səs-küy, qalmaqal olan yer haqqında. *Buranı lap bazara döndəribsiniz.* ☐ **Bazar açmaq** – səs-küy salmaq, qalmaqal salmaq.

6. Keçmişdə quzuçu və buzovçuların həftədə bir dəfə bazar günləri məhsul şəklində aldıqları muzd.

**BAZAR**[2] *is.* Həftənin şənbədən sonra gələn günü; yekşənbə. *Bazar günü. Gələn bazar sizə gələcəyəm.* ☐ **Bazar ertəsi** – həftənin bazardan sonra gələn günü; düşənbə.

**BAZARBAŞI** *is.* Keçmişdə bazara nəzarət edən şəxs. *Sevər arvadın əri ilə qaynını bazarbaşı tutub saxlayıbdır.* P.Makulu.

**BAZARÇA** *is.* Kiçik bazar. [Qoçular] *gündüz günortaçağı küçə bazarçalarında atışar və istədikləri adamları öldürə də bilərdilər.* H.Sarabski.

**BAZARÇI** *is. məh.* Bazarda, meydançada alver edən adam.

**BAZAR-DÜKAN** *top.* Bazarlar və dükanlar. *Məşədi Məmməd gündüzlər bazar-dükanı dolanıb, çayxanaları gəzərdi.* B.Talıblı.

**BAZARI** *sif.* Bazarda satılmaq üçün hazırlanmış, adətən aşağı keyfiyyətli. *Bazarı çəkmə. Bazarı palto.* // Ümumiyyətlə, keyfiyyətsiz, səliqəsiz, davamsız, qaba, ucuz, çox sadə (mal haqqında).

**BAZARLAŞMA** "Bazarlaşmaq"dan *f.is.*

**BAZARLAŞMAQ** *f.* 1. Alış-veriş zamanı qiymət üstündə danışaraq uzlaşmaq, sazişə gəlmək, qiymət kəsmək. // *məc.* Mübarizə etmək, razı olmamaq, inad edərək şərtlər irəli sürmək.

2. Bazarlıq etmək.

**BAZARLIQ** 1. *is.* Bazardan alınmış şeylər. ☐ **Bazarlıq etmək** – 1) bazardan ev üçün lazımi şeylər almaq. [Nəbi ağa:] *Özün buyur-*

*muşdun ki, məni tez oyat, axşama qonaqlarım var, gərək bazarlıq edəm*. S.S.Axundov. *Firəngiz bazarlıq edir, xörək hazırlayır, ata və oğulun yolunu gözləyirdi.* S.Rəhimov; 2) alver etmək. *Hazırda sizinlə bazarlıq edəcək tacirlərdən deyilik*. M.S.Ordubadi.

2. *is. etnoqr.* Ərə gedən qız üçün paltar. *Çox mübarək, çox mübarək, ölmədik, oğlumuzun toyunu gördük, – deyə Kəblə Xeyransa bazarlığı kişinin əlindən alıb sahmanlayır*. H.Sarabski. *Sabahı günü Əhməd kişi işdən qayıdandan sonra qızını evdə tapmadı. Tərs kimi bu gecə qıza bazarlıq gələcəkdi.* Ə.Məmmədxanlı. □ **Bazarlıq etmək** – toy üçün lazımi şeylər almaq.

3. *sif*. Bazarda satmaq üçün hazırlanan.

**BAZBURUD** *is*. [əsli *fars.* bad burut] *dan.* Görkəm, boy-buxun, bədən quruluşu. [Qara xan:] *Elə bazburudundan oxşayırsan; səni özümə ilxıçı edərəm*. "Koroğlu*". Yəhyanin dili gödək olacaq, "Nə bilim, – deyəcək, – bazburuduna inandım"*. Mir Cəlal.

**BAZBURUDLU** *sif. dan.* Boylu-buxunlu, qədd-qamətli. *Xəlil paşa belə bazburudlu oğlanları görüb mat qaldı*. "Koroğlu".

**BAZÉDOV** [*xüs. is.-dən*]: **bazedov xəstəliyi** *tib.* – qalxanvari vəzinin fəaliyyətinin pozulması nəticəsində törəyən xəstəlik.

**BAZI**[1] *is. məh*. 1. Xışın, cütün ulamadan kötüyə qədər olan hissəsi; qol.

2. İki zəmi, tarla arasında mərz; dikdir.

3. Halqa, dairə. *Üzük bazısı*.

**BAZI**[2] *is*. [*fars*.] *dan.* Oyun, kələk, hiylə, biclik. □ **Bazı gəlmək** – kələk gəlmək, biclik işlətmək. [Şərəfnisə xanım:] *Bəsdir, Allahı sevirsən, bu bazıları mənə az gəl!..* M.F.Axundzadə.

**BAZI**[3] *is*. Çöl, quru düzənlik, səhra.

...**bazlıq**. Bəzi sözlərin sonuna gətirilərək, mürəkkəb isim düzəldilir; məs.: kələkbazlıq, hiyləbazlıq, oyunbazlıq və s.

**BAZİÇƏ** *is*. [*fars*.] Oyuncaq. *Böylə-böylə sözlərin mən olmaram baziçəsi; Olsun, olsun, qoy çox olsun, böylə ləzzətli həyat!* M.Ə.Sabir. *Uşaqcıqlar kimi baziçələrə aldanaraq; Mütəsəlli olar, istər daha artıq yaşamaq*. A.Səhhət. *Əxtərlər, ey ziyaları titrək sitarələr; Baziçə eyləmiş sizi də pənceyiqədər?* M.Hadi.

**BAZİRGAN** *is*. [*fars*.] *köhn*. Tacir.

**BAZİRGANBAŞI** *is. köhn.* Tacirbaşı.

**BÁZİS** *is*. [*yun*.] Müəyyən cəmiyyətin üstqurumunun real əsasını təşkil edən ictimai istehsal münasibətlərinin məcmusu. *Bazis və üstqurum.*

**BAZU** *is*. [*fars*.] Qolun çiyindən dirsəyə qədər olan hissəsi; qol. *Ol gümüş biləklər, şümşad bazular; Yada düşər, işim ahü zar olur. M.*Vaqif. *Nə çapırsan bu qədər dağları sən, ey Fərhad; Tələbi-vəsl məgər qüvvətibazu ilədir.* S.Ə.Şirvani. *Ağır atletika əzələləri, xüsusən, qol, bazu və gövdə əzələlərini olduqca inkişaf etdirir.* Babayev.

**BAZUBƏND** *is*. [*fars*.] 1. Qolbaq, bilərzik. *Xədəmələr durar sağü solunda; Cavahir bazubənd iki qolunda.* Nəbati. *Bu halda şah, başında tac və əlində cavahirnişan toppuz, qolunda cavahir bazubəndlər .. taxta çıxıb oturdu.* M.F.Axundzadə. *Salıbsan gərdənə heykəl, həmail; Qızıl bazubəndlər qola yaraşar*. Aşıq Ələsgər.

2. Qədimdə döyüşçülərin qollarına geydikləri dəmir qolçaq.

3. *din.* İçərisində nəzər duası, yaxud dua kitabçalarından bir nüsxə qoyulmuş, meşin və ya parça qovluq; qolbənd.

**BAZUÖNÜ** *is. anat.* Qolun dirsək oynağından biləyə qədər olan hissəsi.

**BE** "B" hərfinin və bu hərflə işarə olunan səssizin adı. // b a x **bey**.

**BECA** b a x **bica**

**BECƏRİLMƏ** "Becərilmək"dən *icb*.

**BECƏRİLMƏK** *məch*. Yetişdirilmək, bəslənib yetişdirilmək.

**BECƏRMƏ** "Becərmək"dən *f.is. Becərmə işləri. – Xanpərinin də sahəsində becərmə gedir, pambıq seyrəlirdi.* Ə.Vəliyev.

**BECƏRMƏK** *f.* Xidmət edərək, bəsləyərək yetişdirmək. *Bağ becərmək.* – [Heydər bəy:] *Qulaq as, gör mənə nə cavab verdi: Heydər bəy, cüt ək, bağ becər, alış-veriş elə.* M.F.Axundzadə. *Salman kişi Daşlıca ağzında bostan becərərdi*. Mir Cəlal. // Tərbiyələndirib böyütmək, yetişdirmək. [Pası:] *Gül kimi uşaq becərmişəm, özünə dadandırıb qardaşın Gülo kimi külə döndərəsən?* S.Rəhimov.

**BECƏRTMƏ** "Becərtmək"dən *f.is.*

**BECƏRTMƏK** "Becərmək"dən *icb.*

**BECİD** *zərf dan.* Tez, yeyin, sürətli, cəld. *Tez ol, becid gəl.*

**BEÇÇƏ** b a x **beçə.**

**BEÇƏ** *is.* [*fars.*] 1. Bala.

2. Çolpa, cavan xoruz. *Siz sərv kimi sərkəş olub böylə boy atdız; İllik beçətək banlayaraq, xalqı oyatdız.* M.Ə.Sabir. *Dan atınca xoruz, beçələr banlar.* A.Şaiq. *Xalq ehtiyac içində əziyyət çəkdiyi zaman, Tərlan ağınabozuna baxmadan, beçədən, əmlikdən kəsdirib yeyirdi*. M.Hüseyn.

3. Cavan bal arısı. ◻ **Beçə vermək** – b a x **beçələmək.** [Piri kişi:] *Yaxşı vaxtında gəlmişik, bu saat buranın arısı beçə verəcəkdir.* S.S.Axundov. *Arılar beçə verən zaman kənd adamı meşəni dolanar, bu arı pətəklərindən tapar, hər birisindən pudlarla bal götürərdi*. S.Rəhimov. **Beçə balı** – cavan arının balı, təmiz ağ bal. *Gülpərinin İdris üçün saxladığı beçə balı, motal pendiri və kərə yağı Əlyarovun çox xoşuna gəldi*. M.Hüseyn.

**BEÇƏDAN** *is.* [*fars.*] Uşaqlıq, balalıq, ana qarnı.

**BEÇƏXOR** *is*. [*fars*.] Qadınların uşaqlıqlarında əmələ gələn bir xəstəliyin xalq arasında adı.

**BEÇƏLƏMƏ** *f.is.* Yeni əmələ gəlmiş ana arı və işçi arıların səbətdən çıxıb döl verməsi.

**BEÇƏLƏMƏK** *f.* 1. Beçə vermək, özündən yeni arı dəstəsi ayırmaq. *Arılar yayda beçələmişdir.*

2. Zoğ atmaq, zoğlanmaq, yeni zoğ vermək.

**BEH** *is*. [*ər*.] Bütün təəhhüdün, ya sifarişin yerinə yetirilməsini təmin etmək üçün işi icra edən şəxsə qabaqca verilən pul. *Beh almaq. Beh vermək. Behi qaytarmaq* (sövdəni pozmaq, dəbbələmək). – *Faytonçu Mürsələ, üç yoldaş hər birimiz, bir manat beh vermişdik ki, filan günü atları qoşub gəlsin, bizi aparsın.* C.Məmmədquluzadə. *Bu tacirlər evə müştəri gözü ilə baxdılar, Ağayevlə sövdələşdilər, beh verib, elə həmin gün köçdülər*. S.Rəhman.

**BEHBAZAR** *is*. *dan.* Sözübütövlük, etibar, sövdə, vədədə doğruluq.

**BEHBUD** *is.* Qalın tiyəli, qında gəzdirilən iri bıçaq (silah).

**BEHBUDLAMA** "Behbudlamaq"dan *f.is.*

**BEHBUDLAMAQ** *f.* Behbudla vurmaq, behbudla yaralamaq.

**BEHBUDLANMAQ** *məch.* Behbudla vurulmaq, yaralanmaq.

**BEHBUDLAŞMA** "Behbudlaşmaq"dan *f.is.*

**BEHBUDLAŞMAQ** *qarş.* Bir-birini behbudla vurmaq, yaralamaq.

**BEHİŞT** *is*. [*fars*.] 1. Dini etiqadlara görə, bu dünyada savab iş görmüş adamların axirətdə səadət içərisində yaşayacaqları yer; cənnət. [Xortdan:] *Pərvərdigara, belə müqəddəs kişi cəhənnəmə düşəndə bəs behiştə kim göndəriləcək?* Ə.Haqverdiyev.

2. *məc.* Son dərəcə gözəl, mənzərəli, ürəkaçan yer haqqında. *Dünya gözümdə behişt bağına döndü.* M.F.Axundzadə. [Rüstəm:] *Paris, nə Paris! Yer üzünün behişti desək, yenə xata eləməmişəm!* Ə.Haqverdiyev. [Səfər bəy:] *Pəh, pəh xudavəndi-aləm gör nə gözəl yerlər yaradıb, bura nəinki "el bulağı", lap behiştin bir guşəsi demək olar...* B.Talıblı. *Bir bağım var, səfalı, yaraşıqlı və behişt kimi bir yerdir*. M.İbrahimov. // Şairanə təşbihlərdə. *Sən bir behiştsən, zəmzəm ziynətdir; Nə fərq elər əhvalıma, sevdiyim*. M.V.Vidadi. *Mənim bağü behiştim yardır, cənnətdə karım yox.* S.Ə.Şirvani.

**BEHİŞTLİK** *sif.* və *is*. Dini nöqteyinəzərdən günahsız olduğu üçün behiştə layiq olan (ölən adama hörmət üçün deyilir). – *Hacı, Allah atanı behiştlik eləsin.* Ə.Haqverdiyev.

**BEHLƏMƏ** "Behləmək"dən *f.is.*

**BEHLƏMƏK** *f.* Beh vermək.

**BEHLƏŞMƏ** "Behləşmək"dən *f.is.*

**BEHLƏŞMƏK** *qarş*. Beh verib şərtləşmək, razılaşmaq, sazişə girmək, uzlaşmaq. *Novruzqulu .. karvansaraya gedib, arabanı danışıb behləşərdi*. H.Sarabski.

**BEHLİ** *sif.* Beh alınmış, behi verilmiş; satılmış.

**BEHMAN** *dan.* Adətən filan-behman şəklində işlənir (b a x **filan-behman**).

**BEKON** *is.* [*ing.*] Hisə verilmiş və ya duzlanmış piysiz, cavan donuz əti.

**BEL**[1] *is.* 1. Bədənin ortası, qurşaq bağlanan yeri. *İncə bel. Beli ağrımaq. Belinə qayış bağlamaq. Belə qədər suya girmək. – Bu süngünü onlar sağ tərəfdən bel qayışlarından*

*asmışdılar*. Ə.Əbülhəsən. *Belində qəbzəli xəncər olan bir kişi içəri girdi.* İ.Əfəndiyev.

2. İnsanın və bəzi heyvanların qarnının arxa tərəfi, sağrı ilə çiyinlər arasındakı hissə; dal. *Əyri bel. Beli bükülmüş. Yükü atın belinə qaldırmaq. – Elə, obaya səs düşür. İgidlər at belinə qalxır.* M.İbrahimov. *..Kürən at belində ağırlıq hiss etməyib yolun çoxusunu oynaqlayır*. S.Rəhimov. □ **Bel sümüyü** *anat*. – onurğanın ayrıca sümüyü. **Bel sütunu** *anat*. – insanda və bəzi heyvanlarda: bel ortasındakı bir-birinin içinə keçmiş sümük və qığırdaqlardan ibarət onurğa sümüyü.

3. *məc*. Hündür dağın iki təpəsi arasındakı əyrilmiş yer və alçaq keçid. *Şehli kəndinin sağ tərəfində yalın beli ilə xırmanlar salınmışdı.* S.Rəhimov. *Baxsanız a, beli çökmüş yamaca; Sinəsində şən quzular bəslənir*. A.Şaiq. *Min Qazaxda köhlən ata; Göy yaylaqlar belinə qalx*. S.Vurğun.

4. *məc*. Dövrə, ətraf. *Şəhərin belinə yarımqurşaq kimi dolanan minlərcə sahil işıqları yerə səpilmiş ulduzlar kimi sayrışırdı*. M.Hüseyn.

◊ **Bel bağlamaq** – güvənmək, inanmaq, etibar etmək, arxalanmaq, arxayın olmaq, xatircəm olmaq. *Sənin qapında Firəngiz həqir cariyədir; Günəş də xidmətə bel bağlamış dilü candan.* Heyran xanım. [Bayram:] *Zalxa hiyləgər arvaddır, ona bel bağlamaq olarmı?* M.F.Axundzadə. *Naçalniklərə, pristavlara, yasavullara bel bağlamaq olmaz*. Ə.Haqverdiyev. *Bağlamaq bel, ya güvənmək çox çətindir zahidə.* C.Cabbarlı. **Beli bükülmək** – 1) qocalmaq; 2) ağır müsibət, bədbəxtlik, fəlakət üz vermək. **Beli sınmaq (qırılmaq)** *məc.* – b a x **beli bükülmək** 2-ci mənada. [Xan:] *Məmməd, belimiz sındı, – dedi, – görürsən, Ağası duz-çörəyimi itirib, necə namərdlik elədi.* Çəmənzəminli. **Belinə çöpdən dirək** – görülmüş bir işə qarşı istehzalı münasibət bildirən ifadə. *Çox əziyyət çəkirsən, belinə çöpdən dirək*. Ə.Haqverdiyev. **Belini bükmək** *məc.* – ağır bir fəlakətə, bədbəxtliyə, müsibətə məruz qalaraq qocalmaq, ruhən və cismən sarsılmaq. **Belini sındırmaq (qırmaq)** *məc.* – çox ağır mənəvi zərbə vurmaq, son dərəcə sarsıtmaq, bədbəxt etmək.

**BEL²** *is*. Sağ və ya sol yanında ayaqla basmaq üçün çıxıntısı olan uzun saplı qazma aləti. *Dəmir bel. Bel ilə belləmək. – Ulduz həyətə girərkən* [ana] *hasarın yanında əlində bel yer qazırdı*. Ə.Məmmədxanlı. *Fəhlələr işə başladılar. Çoxu yeri bel ilə qazırdı*. Ə.Sadıq.

◊ **Əlinə bel vermək** *məc.* – qızışdırmaq, təhrik etmək. *Dəliyə yer ver, əlinə bel*. (Ata. sözü).

**BELAĞACI** *is. məh.* Arabaya qalanmış otun üstündən atılan uzun ağac.

**BELBAĞI** *is*. Belə bağlanılan hər şey (qayış, toqqa, qurşaq, kəmərbənd və s.). *..Belində gümüş körpülü belbağı, qıçında Çin ipəyindən şalvar olan qonşu oğlu .. yoldaşları ilə söhbətə gedərdi*. H.Sarabski.

**BELBAĞLAMA** *is. etnoqr*. Keçmişdə gəlin köçürüldüyü zaman oğlanın yaxın qohumlarından birinin dəsmal və s. ilə gəlinin belini bağlama adəti. *Belbağlamanın icrasından sonra, Kiçikbəyimin bir qoluna İbrahim xan, o birisinə Vaqif girib, kallayının ortasına gətirdilər*. Çəmənzəminli.

**BELÇİKALI** *is.* Belçika əhalisinə mənsub adam.

**BELETÁJ** [*fr.*] 1. Teatrın tamaşa salonunda parterdən yuxarı birinci yarus. [Yeni teatr binasında tamaşaçı yerlərinin] *bir hissəsi beletaj şəklində 24 lojada yerləşdirilmişdir*. "İncəsənət".

2. Evin aşağıdan ikinci, adətən ən yaxşı mərtəbəsi. *Onun mənzili beletajdadır.*

**BELƏ** *əvəz*. 1. Bu cür, bu təhər, bu kimi, bu sayaq. *Mən belə adam görməmişəm. Belə işlərə yol vermək olmaz. – Fikirləşirəm, .. axırda yəqin edirəm ki, hələ gərək belə də olsun*. M.Ə.Sabir. [Suraxanski:] *Mən heç vaxt .. demərəm ki, məni tərif et. Belə təvəqqe ancaq mənə əskiklik gətirib, mənim şanimə toxunar.* Ə.Haqverdiyev. // Bu qədər, bunca. *Belə gec niyə gəldin? – Sən ki bu qaydada belə gözəlsən; Yoxdu gözəllikdə sənə tay, gözəl.* Aşıq Abbas. [Kərbəlayı Rəcəb:] *Hacı, dərdin alım, nöşün belə kəmhövsələ olmusan?* N.Vəzirov.

2. "Hətta" mənasında bağlayıcı kimi işlənir. *Firidun sual belə vermədən xarabaya girdi*. M.İbrahimov. *Beş dəqiqə belə keçmə-*

*miş asfaltlı yolda təzəcə abı rəngə boyanmış .. maşın göründü*. M.Hüseyn. *Burada ağaclar belə sınmış, bağçalar qurumuş, .. heyvanlar belə sanki qaçıb bu kənddən uzaqlaşmışdılar*. Ə.Məmmədxanlı.

3. Bu boyda, bu yekəlikdə. *Belə ağacın başına qalxmaq çətindir*.

4. *dan*. Bu tərəfə, bu yana, o tərəfə, o yana. *Bir-birimizdən ayrıldıq, mən belə gəldim, o belə getdi*.

5. "Bundan", "bu gündən" sözləri ilə bərabər: bundan sonra, bundan etibarən, başlayaraq. *Bundan belə mən sizə gəlməyəcəyəm. – Nə yaraşır sana, divanə könül; Həmdəm olmaq yara bu gündən belə*. Q.Zakir.

6. Yalnız cəm şəklində: **belələr(i)** – bu cür adamlar. *Belələrinə söz kar eləmir*. M.Hüseyn.

7. Qoşa şəkildə: **belə-belə** – b a x **belə** 1-ci mənada. *Bizə belə-belə adamlar lazım deyil*. C.Məmmədquluzadə. *Belə-belə fikirlər Rüstəm bəyi artıqlığınca məşğul edirdi*. Çəmənzəminli. *Sən belə-belə işlərə qarışmasan, yaxşıdır; özüm bilərəm*. Ə.Əbülhəsən.

8. "Ki" bağlayıcısı ilə: belə ki (əski forması "belə kim") – nəticə bildirən qovuşuq cümlələri birləşdirən bağlayıcı yerində işlənir ("buna görə də" mənasında). *Belə kim mən görürəm dilbərimin, qəmzəsini; Öldürür aşiqi-sərgəştəni mərdanə bu gün*. Reyhan xanım.

◊ **Belə ha** – tərif, bəyənmə mənasında işlənən nida. *Bir qarı fəxrlə dedi: – Belə ha!.. Deyəsən, bu gündən belə xəstəni xəstəxanaya çalğı ilə aparacaqlar*. "Kirpi". **Elə belə** – 1) nə yaxşı, nə pis, babat, miyanə, orta; 2) müəyyən məqsədsiz, qərəzsiz, bikarçılıqdan. *Elə belə tində durmuşdum*. – [Qaçay:] *Elə belə demək istəyirsənsə, de*. Z.Xəlil.

**Belədən-belə** – bir tərəfdən o biri tərəfə, bu yandan o yana. *Yük, minik çəkirsən belədən-belə; İşləmək olmaz, a canım, bir belə!* A.Səhhət. *Göydə əlvan buludlar keçir belədən-belə*. R.Rza.

**BELƏCƏ** *zərf* Bunun kimi, bu cür, bu təhər, belə, tamamilə bu cür, bu qayda ilə, bu tərzdə. [Rüxsarə] *beləcə düşünür və yorulmadan çalışırdı*. S.Rəhimov. *Beləcə, bir qədər dalğınlıqla çölə baxdıqdan sonra, birdən qadın gözlərini döndərdi*. Ə.Əbülhəsən. *Gözəl bir çiçək arını necə cəlb edirsə, Şirinin gözəlliyi də surxayları beləcə cəlb edir*. İ.Əfəndiyev.

**BELƏLİKDƏ** *zərf dan*. 1. Belə olduqda, bu halda, əgər belə olsa. *Beləlikdə mən sənə yoldaş deyiləm*.

2. Bu vəziyyətdə, bu halda, bu qaydada. *İş beləlikdə qaldı*.

**BELƏLİKLƏ** *ara s.* (bəzən "də" ədatı ilə işlənir). Bu qayda ilə, bu cür, demək (nəticə olan ikinci cümlənin əvvəlində işlənir). *Belədiklə, Rüxsarə təbdən-təbə düşürdü*. S.Rəhimov. *Beləliklə də, Cuma iki gün yaxşıca istirahət etdi*. Ə.Əbülhəsən.

**BELİBAĞLI**[1] *sif*. Beli bağlı olan, beli qurşaq və s. ilə bağlanmış.

**BELİBAĞLI**[2] *is. zool*. Qırğı böyüklükdə yırtıcı bir quş.

**BELİBASIQ** *sif. dan*. Belini yəhər vurmuş (minik heyvanı haqqında).

**BELİBÜKÜK** *sif*. Beli bükülmüş, qocalmış. *Doxsan yaşlı belibükük bir kişi*.

**BELİƏYRİ** *sif*. 1. Beli əyilmiş.

2. *məc*. Qoca, çox yaşlı adam mənasında.

**BELLETRÍST** [*fr*.] Belletristika əsərləri müəllifi.

**BELLETRÍSTİKA** [*fr*.] Nəsr şəklində yazılmış bədii ədəbiyyat – romanlar, povestlər, hekayələr.

**BELLƏMƏ** "Belləmək"dən *f.is*.

**BELLƏMƏK** *f*. Bel ilə qazımaq (torpağı). *Payızda bağı belləmək xeyirlidir*.

**BELLƏNMƏ** "Bellətmək"dən *f.is*.

**BELLƏNMƏK** *məch*. Bel ilə qazılmaq.

**BELLƏTDİRMƏK** b a x **bellətmək.**

**BELLƏTMƏ** "Belləmək"dən *f.is*.

**BELLƏTMƏK** *icb*. Bel ilə qazdırmaq (torpağı).

**BELLİK** *is. məh*. Bir baş su, müəyyən ölçüdə axar su.

**BELORÚS** Belorusun (keçmiş Belorusiyanın) əsas əhalisini təşkil edən və dil cəhətdən şərqi slavyan xalqları qrupuna daxil olan xalq və bu xalqa mənsub adam.

**BELORUSCA** *zərf* Belorus dilində. *Belorusca danışmaq*.

**BEMÓL** [*ital*.] *mus*. Səsi yarım ton alçaltmaq üçün not işarəsi.

**BENEFÍS** [*fr.*] *köhn.* Teatr işçisi, yaxud artist xeyrinə verilən tamaşa, ya konsert. // Artistin xidmətini, məharətini, əhəmiyyətini qeyd etmək üçün onun şərəfinə verilən tamaşa.

**BENUÁR** [*fr.*] Teatr zalında parter ilə bir səviyyədə olan loja.

**BENZÍN** [*xar.*] Əsasən neftdən və ya daş kömür kitrəsindən distillə yolu ilə, yaxud süni surətdə alınan rəngsiz, tezalışan uçucu maye.

**BENZİNDAŞIYAN** *sif.* və *is.* Benzin daşımaq üçün uyğunlaşdırılmış (avtomobil və s.). *Benzindaşıyan maşın.*

**BENZİNTÖKƏN** *sif.* və *is.* Maşınlara və s.-yə benzin tökməyə məxsus. *Benzintökən cihaz.*

**BENZÓL** [*fr.*] Daş kömür kitrəsindən, neftdən və s. distillə yolu ilə hasil edilən rəngsiz maddə (boya maddələri, partlayıcı maddələr, dərman və s. istehsalında işlədilən).

**BERDÁNKA** [*rus.*] 1870-1891-ci illərdə rus ordusunda işlədilən birpatronlu tüfəng. *Yasavul uzun qırmızı təpəli sarı papağını .. berdankasının başına keçirmişdi.* S.Rəhimov. [Namaz:] *Nə təhər olsa, bizə xeyli berdanka, aynalı tapmalısan.* P.Makulu.

**BERÉT** [*fr.*] Günlüyü və kənarları olmayan yumşaq baş geyimi.

**BERÍLLİUM** [*yun.*] *kim.* Gümüşü rəngli çox yüngül bərk metal; kimyəvi element. *Nadir və az tapılan elementlərdən volfram, molibden, berillium .. və başqaları xüsusi yer tutur və onların yeni yataqlarının tapılması elm və texnikanı çox maraqlandırır.* M.Qaşqay.

**BERKUT** *is. zool.* Qartal cinsindən yırtıcı quş.

**BERTOLÉ** duzu [*xüs. is.*-dən] Kimya sənayesində və təbabətdə işlənən kristallik ağ poroşok (kalium-xloratın köhnə adı).

**BESTSELLER** *is.* [*ing.*] Çox yaxşı satılan, pula yaxşı gedən kitab.

**BEŞ**[1] *say.* Dörddən sonra gələn ədəd – 5. ☐ **Beş-altı, beş-on** – az, cüzi, əhəmiyyətsiz miqdarda, bir neçə. *Cibimdə beş-altı qəpik pulum var. İclasa beş-on adam gəlmişdi.* – [Kərim baba] *odun gətirməyə getsə, görərsən beş-on çırpını arxasına alır və dərhal "Ayrım qızı, Ayrım qızı! Bunu hara töküm?" – deyə bar-bar bağırırdı.* A.Şaiq. [Çimnaz:] *..A kişi, cavan qızın olsun, gedib beş-altı arşın tumanlıq üçün ölsün!* Ə.Əbülhəsən. **Beşdə bir** – tez-tez, hər beş gündə bir dəfə. *Beşdə bir bizə gəlir.* **Beşdə-üçdə** – bəzən, hərdənbir, arabir, gah-gah. *Dəmiryol xəttində işləsə də, beşdə-üçdə ezamiyyət yolu ilə Bakıya gəlir, evinə baş çəkirdi.* M.Hüseyn. **Beş kişinin biri** – b a x **kişi**.

**Beş-beş** *zərf* Hər dəfə beş dənə, hər adama beş dənə. *Almaları beş-beş payla! Sıraya beş-beş düzülmək.*

**BEŞ**[2] *is. məh.* Quru, nazik və tezyanan odun.

**BEŞAÇILAN** b a x **beşatılan**. *Əsgər ondan* [dükançıdan] *cəld qalxıb, abasının altından beşaçılan tüfəngini çıxardıb, patronlayıb dedi..* Ə.Haqverdiyev. *Çiynində beşaçılan; Sol qolunda kəlağay; Gəldi Don kənarına.* M.Rahim.

**BEŞATAN** b a x **beşatılan**. *Qoçular, quldurlar qatar taxardı... Beşatanın çata-çata çıxmışdı.* Aşıq Ələsgər.

**BEŞATILAN** *is. dan.* Xəzinəsi beş patron tutan tüfəng. [Maro] *evin küncündə qara tumac qoburda olan sarı qundaq beşatılanı çıxartdı.* S.Rəhimov.

**BEŞAYLIQ** *sif.* 1. Beş ay üçün düzəldilmiş, beş aylıq müddət nəzərdə tutulmuş, yaxud beş ay ərzində olmuş. *Beşaylıq məlumat. Beşaylıq kurs.*

2. Yaşı beş ay olan. *Beşaylıq uşaq.*

**BEŞBARMAQ** *is.* 1. Barmaqlara taxılaraq, əl içində sıxılıb tutulan metal barmaqlıq şəklində silah.

2. Şana, beşdişli yaba.

**BEŞBAŞLI** *sif.* Beş başı, beş ucu, beş tini, beş təpəsi olan. *Beşbaşlı dağ.*

**BEŞBETƏR** *sif.* [beş və *fars.* bədtər] Daha pis, ən pis, çox pis. [Əlyarov:] *Eh, ay əmioğlu, sən də məndən beşbetər ağıldan kasıbsan ha!* M.Hüseyn.

**BEŞBİR** *zərf* Beş-beş. *Adamlar dəstə-dəstə, üçbir, beşbir bağda gəzir, söhbət edirdilər.* M.İbrahimov.

**BEŞBUCAQLI** 1. *is.* Beş bucağı olan həndəsi cisim, beşkünclü cisim.

2. *sif.* Beş bucağı olan. *Beşbucaqlı fiqur.*

**BEŞCƏ** *sif.* Ancaq beş, yalnız beş. *Beşcə manat pul. Beşcə varaq kağız.* // Bəzən təyin

etdiyi sözə böyüdücülük mənası verir. *Niyə bəyənmirsən, beşcə manat pul vermişəm.*

**BEŞCƏRGƏLİ** *sif.* 1. *k.t.* Beş sıra ilə əkilən. *Beşcərgəli əkin.*

2. Beş sırası olan. *Beşcərgəli qarmon.*

**BEŞDAŞ** *is.* Xırda daşlarla oynanan bir oyun adı. *Beşdaş oynamaq. – Hərdənbir üçü bir yerdə oynadıqları da "beşdaş" oyunu olardı.* T.Ş.Simurq.

**BEŞFAİZLİ** *sif.* Beş faiz gəlir verən.

**BEŞGİRVƏNKƏLİK** *sif. köhn.* Beş girvənkə ağırlığında olan çəki daşı. ☐ **Beşgirvənkəlik qıfıl** – üst tərəfi çıxıb taxılan böyük asma qıfıl.

**BEŞGÖZ(LÜ)** *sif.* Beş gözü olan. *Beşgöz(lü) körpü. Beşgözlü dükan.*

**BEŞGUŞƏ(Lİ)** 1. B a x **beşbucaqlı.**

2. Beş tili, beş tini olan. *Beşguşəli fiqur. Beşguşəli ulduz. – Beşguşəli ulduz ilə öpüş, ay!* H.K.Sanılı.

**BEŞGÜL** *sif.* Beşbucaqlı, beşguşəli.

**BEŞGÜNLÜK** *sif.* 1. Beş gün sürən, beş gün davam edən, yaxud beş gün tələb edən. *Beşgünlük möhlət. Beşgünlük yol. Beşgünlük iş.* // Beş günə çatan, kifayət edən. *Beşgünlük ehtiyat.*

2. *məc.* Az davam edən, az sürən; müvəqqəti, sürəksiz, davamsız. *Beşgünlük ömür. Beşgünlük yoldaş. Beşgünlük dünya.*

**BEŞXALLI** *sif.* Üzərində beş xalı olan. *Beşxallı kart* (*qumar kağızı*).

**BEŞİK** *is.* 1. Körpə uşaqlara məxsus yırğalanan kiçik yatacaq. *Bir körpə uşaq beşikdə yatmış; Rahət əl-ayaqların uzatmış.* A.Səhhət. *Salınız yadınıza o günləri ki, ananız sizi beşikdə yırğalaya-yırğalaya sizə türk* [Azərbaycan] *dilində lay-lay deyirdi.* C.Məmmədquluzadə. *Yatır eyvanda körpə, qədim asma beşikdə.* M.Rahim.

2. *məc. tənt.* Bir şeyin törədiyi, meydana gəldiyi yer; mənbə, yurd, ocaq, Vətən mənasında. *Şirvan vilayəti qədimdən şüəra və ürəfa beşiyi olmağını mərhum Hacı Seyyid Əzim dəxi öz tərcümeyi-halına dair yazdığı mənzumatında təsdiq* (*edir*). F.Köçərli. *Gözəl vətən! Mənan dərin; Beşiyisən gözəllərin!* S.Vurğun. *Burda beşiklərimiz üzərinə göydə süzən qartalların kölgəsi düşmüşdür.* Ə.Məmmədxanlı.

**BEŞİKKƏRTMƏ** *is. etnoqr.* Köhnə məişətdə: uşaqların (oğlan və qızın) körpə zamanlarından bir-birinə adaxlı edilməsi adəti.

**BEŞİLLİK** 1. *sif.* Beş il sürən, beş il müddətli, beş il davam edən. *Beşillik məktəb. Beşillik xidmət.* // Beş il müddətinə tərtib edilmiş, beş ili nəzərdə tutan. *Beşillik neftçıxarma planı.*

2. İs. mənasında. *Birinci beşillik. Beşillik dörd ildə yerinə yetirildi. – Niyə mən istəyən olmasın? Niyə? Mənim beşilliyim dolmasın, niyə?* M.Müşfiq.

3. *sif.* Beş yaşında olan, beşyaşar. *Beşillik at. Beşillik ağac.*

4. *sif.* Beş ildən qalma, beş il ömrü olan. *Beşillik şərab.*

**BEŞİNCİ** "Beş"dən *sıra s. Beşinci sinif. Beşinci adam. Beşinci cərgə.*

**BEŞKÜNC(LÜ)** b a x **beşguşə(li).**

**BEŞQAT(LI)** *sif.* 1. Beşmərtəbə(li). *Beşqat ev.*

2. Bir-biri üzərində beş lay olan. *Beşqat xəmir.*

**BEŞQƏPİKLİK** *sif.* Beş qəpiyə dəyən, beş qəpik qiymətində olan. *Beşqəpiklik marka.* // *is.* Birşahılıq metal pul.

**BEŞQRAMLIQ** *is.* Beş qram ağırlığında olan. *Beşqramlıq daş.*

**BEŞLƏÇƏKLİ** *sif.* 1. *bot.* Beş ləçəyi, beş yarpağı olan (bitki).

2. Beş parçadan ibarət olan.

**BEŞLİK** 1. *is.* Beş manatlıq pul. *Rəsul qarının ovcuna bir qızıl beşlik basıb yola saldı.* "Aşıq Qərib". *Aslan hər iki beşliyi götürüb bükdü və Qulam dayının eyvanına tərəf boylandı.* S.Rəhimov.

2. *is.* Kart oyununda beşxallı kağız.

3. *sif.* Beş nömrəli. *Beşlik lampa. Beşlik piltə. Beşlik taxta. – ..Beşlik hisli çırağı yandıraraq, qumar oynamağa otururdular.* S.Rəhman.

4. *sif.* Beş vahiddən ibarət ölçü və ya şey. *Beşlik kisə* (*beş kilo, ya beş pud tutan kisə*).

**BEŞMANATLIQ** 1. *is.* Beş manat qiymətində olan kağız pul; beşlik. *Beşmanatlığı xırdalamaq.*

2. *sif.* Beş manata dəyən, beş manat qiymətində olan. *Beşmanatlıq ətir.*

**BEŞMƏRTƏBƏ(Lİ)** *sif.* Beş mərtəbəsi olan; beşqat. *Beşmərtəbə*(*li*) *ev.*

**BEŞMİNLİK** *sif.* Sayı beş min olan, beş min nəfərdən ibarət olan. *Beşminlik qoşun.*

**BEŞOTAQLI** *sif.* Beş otağı olan, beş otaqdan ibarət olan. *Beşotaqlı mənzil.*

**BEŞSİNİFLİ** *sif.* Beş sinifdən ibarət olan. *Beşsinifli məktəb.*

**BEŞTONLUQ** *sif.* Beş ton yük və s. tutan. *Beştonluq avtomobil.* // Beş ton ağırlığında olan. *Beştonluq yük.*

**BEŞULDUZ(LU)** *sif.* Üzərində beş ulduz şəkli olan. *Beşulduzlu konyak, beşulduzlu hotel.*

**BEŞVERSTLİK** *sif. köhn.* Düyümü beş verst hesabı ilə hesablanmış. *Beşverstlik xəritə.*

**BEŞYARPAQLI** *sif. bot.* Beş yarpağı olan, beş yarpaqdan ibarət olan.

**BEŞYAŞAR** *sif.* Beş yaşı olan. *Beşyaşar heyvan.*

**BEŞYAŞLI** *sif.* Beş yaşı olan. *Beşyaşlı uşaq.*

**BEŞYERLİ** *sif.* Beşadamlıq yeri olan. *Beşyerli loja. Beşyerli avtomobil.*

**BEŞYÜZLÜK** *sif.* Beş yüz manata dəyən, qiyməti beş yüz manat olan.

**BÉTA** Yunan əlifbasının ikinci hərfinin adı. ◊ **Beta şüalar** *fiz.* – radioaktiv maddələrin buraxdığı elektronlardan, ya pozitronlardan ibarət şüa növlərindən biri.

**BETƏR** *sif.* və *zərf* [*fars.*] 1. Daha pis, daha yaman, daha bərbad, lap pis. *Xəstənin halı dünənkindən betərdir. – Ümid ilə ömrüm oldu zaye; Halım betər etdi zəfi-tale.* Füzuli. *Ol zaman ki, bu mənzildən köç olur; İşin olur tamam betər, ağlarsan.* M.V.Vidadi. *Pis hərəkət etsəm, utannam özüm; Halım olar betər, yazım, yazmayım?* M.Ə.Sabir.

2. Daha çox, daha artıq, daha güclü, daha şiddətli. *..Bu sükut dekabr qaranlığından daha betər ürək sıxırdı.* Ə.Əbülhəsən.

**BETƏRLƏŞMƏ** "Betərləşmək"dən *f.is.*

**BETƏRLƏŞMƏK** *f. dan.* Daha pis olmaq, daha da pisləşmək, daha da xarablaşmaq, daha bərbad olmaq, daha da pozğunlaşmaq.

**BETÓN** [*fr.*] 1. Çınqıl, xırda çaydaşı, qum və sement məhlulu və s. qatışığından ibarət tikinti materialı. [Müəllim:] *Buranın bəndi betondan deyil, sadəcə torpaqdan olacaqdır.* Ə.Sadıq. *Çaylar geyir donunu qranitdən, betondan.* Ə. Cəmil.

2. *Sif. mənasında.* Betondan qayrılmış. *Beton özül. Beton divar. Beton döşəmə.*

**BETONÇU** *is. xüs.* Beton hazırlayan, beton işləri mütəxəssisi olan fəhlə.

**BETONÇULUQ** *is.* Betonçunun işi, sənəti, ixtisası; beton işləri.

**BETONQARIŞDIRAN** *is. xüs.* Beton hazırlayan maşın (cihaz).

**BETONLAMA** "Betonlamaq"dan *f.is.*

**BETONLAMAQ** *f.* Betona tutmaq, betonla bərkitmək, üzərinə beton döşəmək.

**BETONLANMA** "Betonlanmaq"dan *f.is.*

**BETONLANMAQ** *məch.* Betona tutulmaq, betonla bərkidilmək, beton döşənmək. *Sahil betonlanmışdır.*

**BETONLANMIŞ** *f.sif.* Betonla bərkidilmiş.

**BETONLATMAQ** "Betonlamaq"dan *icb.*

**BETONLU** *sif.* Betona tutulmuş, betonla bərkidilmiş, betonla örtülmüş. *Betonlu sədd. Betonlu divar.*

**BEY** *is.* [*ər.*] Ərəb əlifbasında ب (b) hərfinin adı. *Bilmək nə gərək kim, bu əlifdir, bu da beydir.* M.Ə.Sabir.

**BEYƏT** *is.* [*ər.*] *köhn.* Birinin hakimiyyətini qəbul edərək ona tabe və sadiq olma. *Aşinalar ixtilatında sədaqət görmədim; Beyətü iqrarü imanü dəyanət görmədim.* M.P.Vaqif. *Beyət mərasimi gecə qaranlıq düşənə qədər davam etdi.* M.S.Ordubadi. □ **Beyət etmək** – tabe olmaq, hakimiyyətini qəbul etmək. [Cəfərqulu xan:] *Mən Qacar nəslinin gözünün qabağında sənə əbədi beyət eləmək istəyirəm.* Ə.Haqverdiyev.

**BEYİN** *is.* 1. *anat.* Mərkəzi sinir sisteminin ən mühüm üzvü, habelə bu üzvü təşkil edən və kəllə ilə bel sümüyü kanalını dolduran maddə. *İnsan beyni. Qoyun beyni. Beyin xəstəliyi.*

2. *məc. dan.* Ağıl, şüur, fəhm, zəka, baş mənasında. *Onun beyni yoxdur, danışığını bilmir. – Bir gün əvvəl küllüyün yanından keçərkən, Firudinin beynində oyanmış fikirlər yenidən baş qaldırdı.* M.İbrahimov. ◊ **Beyni yerindən oynamaq (laxlamaq)** – dəli olmaq. **Beynə batmaq (girmək)** – mümkün hesab etmək, inanmaq. *Bu dediklərin, deyəsən, mənim də beynimə batdı. – Yoldaş, doğrusu, onların sözləri mənim də beynimə batır.* C.Məmmədquluzadə. *Bu söz Həpəndovun beyninə batdı.* Mir Cəlal.

**Beyni dağılmaq** – səs-küydən dəng olmaq, başı ağrımaq. **Beynindən çıxmamaq** – daim fikrində olmaq, yadından çıxmamaq, daim düşündürmək. *Kütlələri təşkil edib böyük bir dağ kimi hərəkətə gətirmək fikri Əlinin beynindən çıxmır.* M.İbrahimov. **Beyninə yeritmək (salmaq)** – bir şeyi birinə tez-tez təkrar edərək inandırmaq, mənimsətmək, təlqin etmək. [Şərəfnisə xanım:] *Müsyö Jordan beyninə salıbdır ki, Parijdə qızlar, gəlinlər məclisdə, yığıncaqda üzüaçıq oturub dururlar.* M.F.Axundzadə. *Usta bu fikri bir çox canlı misallarla uşaqların beyninə yeridirdi*. Ə.Sadıq. **Beynini aparmaq** – çox danışmaqla, səs-küylə birini rahatsız etmək, yormaq, dəng etmək. **Beynini doldurmaq** – birinə bir şey və ya şəxs haqqında çoxlu deyib inandırmaq (yalnız mənfi mənada). [Səlim bəy] *əvvəlcə pristavı evinə çağırıb onun puç beynini lazımi qədər doldurmuşdu.* H.Nəzərli. **Qan başına (beyninə) vurmaq, qan beyninə (sıçramaq)** – b a x **qan**.

**BEYİNCİK** *is. anat.* Beynin, kəllənin dal hissəsində, böyük beynin alt tərəfində yerləşən hissəsi.

**BEYİNƏZİCİ** *sif.* Başı ağrıdan, beyinə əziyyət verən, incidən; ağır, boğucu. *Bir tərəfdən içinə dolmuş bu qədər adamın ağır nəfəsi, bir tərəfdən alaçıq keçələrinin beyinəzici havasından nəfəs almaq mümkün deyildi*. A.Şaiq.

**BEYİNLİ** *sif.* 1. Beyini olan.

2. *məc.* Ağıllı, zəkalı, dərrakəli, düşüncəli.

**BEYİNSİZ** *sif.* 1. Beyini olmayan.

2. *məc.* Ağılsız, axmaq, gic. *Xalqın evini yıxdı, çıxıb bir neçə bədzat; Ax, ax, a beyinsiz!* M.Ə.Sabir.

**BEYİNSİZLİK** *is.* 1. Beyini olmama.

2. *məc.* Ağılsızlıq, axmaqlıq, giclik, anlamazlıq.

**BEYNƏLXALQ** *sif.* [*ər.*] 1. Xarici siyasətə, xalqlar, ölkələr arasındakı əlaqə və münasibətə aid olan. *Beynəlxalq siyasət. Beynəlxalq vəziyyət. Beynəlxalq hüquq*.

2. Yalnız öz xalqına deyil, bir çox başqa xalqlara da şamil və aid olan; xalqlar arasında olan; xalqlararası. *Zəhmətkeşlərin beynəlxalq həmrəyliyi. Beynəlxalq sülh mükafatı. Beynəlxalq təşkilatlar. Beynəlxalq yarışlar. Beynəlxalq qadınlar günü.*

**BEYNƏLMİLƏL** *is.* [*ər.*] *Sif. mənasında.* Millətlər arasında olan, bütün xalqlar tərəfindən qəbul edilmiş; beynəlxalq. *Sabira! Beynəlmiləl tədbiri-ülfət etməli!* M.Ə.Sabir. // Yalnız bir millətə, bir xalqa deyil, bütün başqa millətlərə, xalqlara aid olan, hamı millətlərin istifadə etdiyi, yaşadığı. *Beynəlmiləl şəhər*. // Beynəlmiləlçilik ruhunda. [Mirzə Heydər:] *Beynəlmiləl tərbiyənin bərpası üçün dünya inqilabı lazımdır...* Ə.Haqverdiyev.

**BEYNƏLMİLƏLÇİ** *is.* və *sif.* Beynəlmiləlçilik tərəfdarı.

**BEYNƏLMİLƏLÇİLİK** *is*. Beynəlmiləlçi olmaq; internasionalizm. *Bolşevik beynəlmiləlçiliyi.*

**BEYNƏLMİLƏLLƏŞDİRİLMƏ** "Beynəlmiləlləşdirilmək"dən *f.is.* Bir ərazidən, çaydan və s.-dən bərabər surətdə istifadə etmək üçün müqavilə üzrə bütün dövlətlərə hüquq verilməsi. *Dunay çayının beynəlmiləlləşdirilməsi.*

**BEYNƏLMİLƏLLƏŞDİRİLMƏK** *məch.* Beynəlxalq istifadə üçün azad elan edilmək.

**BEYNƏLMİLƏLLƏŞDİRMƏ** "Beynəlmiləlləşdirmək"dən *f.is.*

**BEYNƏLMİLƏLLƏŞDİRMƏK** *f.* Beynəlmiləl elan etmək, beynəlxalq istifadə üçün azad elan etmək.

**BEYNİBOŞ** *sif. dan.* Ağılsız, axmaq, sarsaq, gic.

**BEYSBOL** *is.* [*ing.*] Top oyunu.

**BEYT**[1] *is.* [*ər.*] İki misradan ibarət olan şeir parçası. *Şerin ikinci beyti. – Azca rəngi özünə gəlmiş Həkimülmülk beyti təkrar etdi*. M.İbrahimov. *Fəhlə yavaş-yavaş hecaladı, bir dəfə oxuyandan sonra ilk beyti əzbərlədi.* M.Hüseyn.

**BEYT**[2] *is*. [*ər.*] *köhn.* 1. Ev, məskən.

2. *din*. Məkkə şəhərində ziyarətgah olan ev. [Qurban:] *Beyt haqqı, a bəy, o yerdə qır nə qədər desən tapılır, bir az qazırsan torpaqdan neft iyi gəlir*. N.Vəzirov. [Hacı:] *Vallah, billah, and olsun getdiyim beytə ki, biz onların qabağında dayana bilməyəcəyik*. P.Makulu.

**BEYTİN** *sif. dan.* 1. Boş, qeyri-məskun (yer haqqında).

2. Sərbəst, azad, işsiz, bikar.

**BEYTLƏŞMƏ** "Beytləşmək"dən *f.is.*

**BEYTLƏŞMƏK** *f.* 1. Üz-üzə durub bir-birinə əzbərdən şeir söyləməklə yarışmaq (beytləşmədə əsas şərt ikincinin söylədiyi şerin birinci hərfi, birincinin söylədiyi şerin axırıncı hərfinin eyni olmasıdır).

2. *məc*. Deyişmək, mübahisə etmək.

**BEYTÜLLAH** *is*. [*ər*.] *din*. 1. Kəbə.

2. Məscid. // *məc*. Gözəlin sifətinə işarədir. *Camalın beytüllah, qaşların mehrab; Kəbə örtüyüdür, müxtəsər, zülfün.* (Qoşma).

**BEYTÜLMAL** *is*. [*ər*.] *din. tar.* İslamiyyətdə: xalqdan toplanılan vergi pullarının və müharibə zamanı məğlub edilən xalqlardan alınan qənimətlərin və s.-nin saxlandığı yer, ev; xəzinə. *Xəzinə işlərinə müdaxilə etmək beytülmala qarşı bir xəyanətdir*. M.S.Ordubadi. *Baş tutdumu beytülmalınız, söylə, sən Allah?* M.Ə.Sabir.

**BEYZƏ** *is*. [*ər*.] *köhn.*1. Yumurta.

2. Dəbilqə.

**BEZ** *is*. Pambıqdan toxunma kobud ağ parça. *Bazarın bir küncündə tikilmiş dükanın içində qədəkdən, bezdən, şilədən, alçaq çitlərdən tökülübdür*. M.F.Axundzadə. ☐ **Xam bez** – şaxı sınmamış kobud bez, nişastaya salınmamış bez. // Bu parçadan tikilmiş. *Bez köynək. – Mövlamqulu əlini uzadıb, onları bir-bir bez torbasına doldurdu*. S.Rəhimov

**BEZAR** *sif.* [*fars.*] Usanmış, bezmiş, çiyrinmiş, təngə gəlmiş; incik, narazı. *Sevgilim, eşqü həvəsdən daha mən bezaram; İndi bir başqa dilarama pərəstişkaram.* A.Səhhət. ☐ **Bezar olmaq** – usanmaq, bezmək, çiyrinmək, təngə gəlmək. *Canından bezar olan tanrıya qarğar*. (Ata. sözü). *Olmuşdu bəşərdən öylə bizar; Kim özgəsini sanırdı əğyar.* Füzuli. *Bu saat camaat dünya davasından bezar olmuşdur*. Ə.Vəliyev. **Bezar etmək** – usandırmaq, təngə gətirmək, cana gətirmək, bezikdirmək, çiyrindirmək. *Şəfqət bacısı yaxınlaşıb, hamını qışqırığı ilə bezar eyləyən bu əsgəri qaldırmaq istədi.* Ə.Əbülhəsən.

**BEZARLAMAQ** *f.* Təngə gətirmək, bezar etmək, cana gətirmək, usandırmaq, təngişdirmək.

**BEZARLANMAQ** *f.* Bezar olmaq, təngə gəlmək, cana gəlmək, usanmaq.

**BEZDİRMƏ** "Bezdirmək"dən *f.is.*

**BEZDİRMƏK** *f.* Təngə gətirmək, usandırmaq, cana doydurmaq, zəhlə tökmək. *Şehli kəndinin dedi-qoduları, dağlarda gedən yersiz səngər atışmaları Şamonu son dərəcə bezdirmişdi.* S.Rəhimov.

**BEZGİN** *sif.* Bezikmiş, təngə gəlmiş, usanmış. ☐ **Bezgin olmaq** – bezikmək, təngə gəlmək, usanmaq.

**BEZGİNLİK** *is*. Bezgin olma, təngə gəlmə, usanma. *Lakin "bezginlik nə üçün?" sualı ilə Qədir yenə öz qabağını kəsdi.* Ə.Əbülhəsən.

**BEZİK** *sif.* Bezmiş, təngə gəlmiş, cana doymuş, usanmış.

**BEZİKDİRİCİ** *sif.* Təngə gətirici, usandırıcı, cana gətirici, zəhlətökən. *Bezikdirici adam.*

**BEZİKDİRMƏ** "Bezikdirmək"dən *f.is.*

**BEZİKDİRMƏK** b a x **bezdirmək**.

**BEZİKMƏ** "Bezikmək"dən *f.is.*

**BEZİKMƏK** *f.* b a x **bezmək**. *Amma Məşədi Nəcəf .. kəndlilərin şikayətindən bezikib, inəyi əmim oğluna satmış imiş.* C.Məmmədquluzadə. *Əlyarov sual-cavabdan bezikmiş kimi ayağa durub, xalıların üstündən asılmış şəkillərə baxdı*. M.Hüseyn.

**BEZMƏ** "Bezmək"dən *f.is.*

**BEZMƏK** *f.* Usanmaq, bezikmək, təngə gəlmək, cana gəlmək, bezar olmaq, bıqmaq. *Canı tərk eylədim, bezdim cahandan; Səni bildim ki, can ilə cahansan*. Nəsimi. *Çoxlarının bezdiyi və uzaq qaçdığı inadlı, şıltaqçı və ağlağan uşaqları Nazimə .. ələ alır, sakit edir, yoluna qoyurdu.* Mir Cəlal.

**BƏ** *əd*. "Bəs" mənasında olub təəccüb bildirir, yaxud sualı gücləndirmək üçün işlənir. *Bə, nə dedin? Bə, sən orada yox idinmi? – Bə, hakim soruşsa ki, niyə mənim davamı içmədin, mən ona nə cavab verim?* C.Məmmədquluzadə. [Səlmə:] *Bə nə, özbaşınadı? Uşqoldakıların geyinib-kecinməyini görmürsən*. Mir Cəlal.

**bə** b a x **ba**.

**BƏB(İ)R** *is*. [*fars.*] Məməli heyvanların yırtıcılar dəstəsinə mənsub pələngəoxşar heyvan. *Vəhşi heyvanlardan Lənkəran sahəsində bəbir və respublikamızın meşələrində çoxlu ayı, tülkü və Sibir samuru vardır*. M.Qaşqay. ☐ **Bəbri-bəyan** *məc.* – çox

qoçaq, çox igid adam haqqında. *Mən dedim bəs Xançobanı cavandır; Bir igid oğlandır, bəbri-bəyandır.* Nəbati. *..Belə qüvvətli, məhabətli, şücaətli cavan, şiri-jəyan bəbri-bəyan...* M.Ə.Sabir.

**BƏBƏ** *is.* 1. Körpə uşaq, çağa.

2. Gəlincik, kukla.

**BƏBƏK** *is*. 1. Göz giləsinin ortasındakı qara dairəcik. [Səba] *güzgüdə göz bəbəklərinin hərəkətini bir neçə kərə imtahandan keçirdi.* M.S.Ordubadi. [Abbasın] *zəfəran kimi qırmızı xətlər görünən yanaqları yumrulandı, dərində gizlənən bəbəkləri parladı.* Mir Cəlal.

2. B a x **bəbə** 1-ci mənada. *O gözəl sevməli, ol nurlu bəbək; Yuxusundan oyanar əsnəyərək.* A.Səhhət.

3. "Göz" sözü ilə bərabər şəfqət və nəvazişlə müraciət. *Dedi: – Oğlum! Göz bəbəyim, sən ey ömür çiçəyim; Tarixlərin şahididir mənim bu ağ birçəyim*. S.Vurğun.

◊ **Bəbək kimi, bəbək tək,** yaxud **göz bəbəyi kimi (qorumaq, saxlamaq** və i.a.**)** – qeydkeşliklə, diqqətlə, əziz bir şey kimi, var gücü ilə. *Bəbək tək bəslədim daim gözümdə xali-hinduni.* Nəsimi. [Təliə:] *Gələcək səadətin xatirəsinə onu* [vəliəhdi] *öz gözümün bəbəyi kimi qoruyacağam*. M.S.Ordubadi.

**BƏBİRLƏNMƏK** *f.* Qabarmaq, kəkələnmək, cürətlənmək; hücum etməyə hazırlanmaq.

**BƏD** *sif.* [*fars*.] 1. Pis, xarab, yaman. *Bəd xasiyyət. Bəd iş. – Oğul bəd övlad olsa; Öldürər dərd atanı*. (Bayatı). *Şairəm, çünki vəzifəm budur əşar yazım; ..Gördüyüm nikü bədi eyləyim izhar, yazım*. M.Ə.Sabir. *Bu minval ilə günahkar muzdur özünün bəd əməlindən peşman olub, istiğfar edə-edə yerindən qalxdı*. S.M.Qənizadə. [Bəşir:] *Məsləhətin bəd deyil, ağlıma yatır*. S.S.Axundov. ☐ **Bəd gəlmək, bəd gətirmək** – pis gətirmək, nəhs gətirmək, baş tutmamaq; uğursuzluğa uğramaq. *İşi bəd gətirmək*. – [Romanov hökumətinin istibdadı] *elə bərk idi ki, dünyanın çalxalanmağa hazırlanan belə bir əsrində yenə qəzetəyə icazə vermək üçün o qədər istixarə elədi ki, bu istixarə axırda bəd gəldi.* C.Məmmədquluzadə. **Bəd nəzər** – mövhumata inananların təsəvvürüncə, guya baxdığı adama və şeyə gözündəki mövhumi qüvvə ilə xətər yetirən pis göz. [Rüstəm:] *Anan da evdə səndən yana bəd nəzərdən qorxur.* S.Rəhimov. **Bəd olmaz** – pis olmaz, eybi yoxdur, yaxşı olar, ziyan etməz. [Odabaşı:] [Hacının] *da halını görmək bəd olmaz*. Ə.Haqverdiyev. [Koxa:] *Üstündən bir çay olsa, heç bəd olmaz.* S.Rəhimov. **Bədinə danışmaq** – pisliyinə danışmaq, qeybət etmək. // Çirkin, yaraşıqsız, yöndəmsiz. *Oranqutanq çox bəd görünüşlü heyvandır*.

2. Hirsli, sərt, qapağan, tutağan. *Bu it çox bəd itdir.*

◊ **Bəd ayaqda** – təhlükəli, xətərli vaxtda, qorxulu dəqiqədə, iş çətinə düşəndə. *Baxdı, gördü Aslandır. Zənn eləmə itirdi; Bəd ayaqda tez özünü bu cəbhələr aslanı*. M.Rahim.

**bəd**... [*fars*.] Bəzi sözlərin əvvəlinə gətirildikdə mənfi mənada mürəkkəb sifət düzəldilir; məs.: bədrəng, bədsifət, bədheybət və s.

**BƏDAHƏT** *is.* [*ər*.] 1. *köhn.* Aşkarlıq, aydınlıq, əyanilik; dəlilə, sübuta ehtiyacı olmama.

2. Birdən-birə, fikirləşmədən söz söyləmə və bu cür söylənilən söz, şeir və s.

**BƏDAHƏTƏN** *zərf* [*ər*.] Birdən-birə, qabaqcadan düşünmədən, qabaqcadan hazırlaşmadan, fikirləşmədən. *Bədahətən bir beyt söylədi.*

**BƏDAVAZ** *sif.* [*fars*.] Pis səsli, çirkin səsli.

**BƏDAYE** [*ər*.] İncəsənətə, bədiiyyata aid olan. *Bədaye teatrı.*

**BƏDBATİN** *sif.* [*fars*. bəd və *ər*. batin] Pisürəkli, qəlbi pis, pisniyyətli; paxıl, kinli. *Bədbatin adam. – Var fəqət bəzi şeyxi-bədbatin; Zahiri-halı xoş, ürək xain.* H.Cavid.

**BƏDBƏXT** *sif.* [*fars*. bəd və *ər*. bəxt] Talesiz, bəxtsiz, taleyi pis, uğursuz. *Bədbəxt adam. Bədbəxt hadisə*. – [Qətibə:] *Ailəmizə üz verən böyük və bədbəxt faciəni sizə bildirməyə məcbur oldum.* M.S.Ordubadi. // İs. mənasında. *Gərçi bu bədbəxt özü elmə həvəskardır; Kəsbi-kəmal etməyə səyi dəxi vardır*. M.Ə.Sabir. [Pristav:] *Bu .. bədbəxtin öküzünü aparıbsan, binəvanı əli qoynunda qoymusan.* Ə.Haqverdiyev. ☐ **Bədbəxt olmaq** – bədbəxtliyə məruz qalmaq, yazıq olmaq. **Bədbəxt etmək** – bədbəxtliyinə səbəb olmaq.

**BƏDBƏXTANƏ** *zərf* [*fars.*] Bəxtsizcəsinə, talesizcəsinə, uğursuzcasına. *Neçin arif yaşar dünyada bədbəxtanə, bilməm ki.* M.Hadi.

**BƏDBƏXTÇİLİK** *dan.* b a x **bədbəxtlik**.

**BƏDBƏXTLİK** *is.* Talesizlik, bəxtsizlik; fəlakət, müsibət, uğursuzluq. *Bədbəxtlik üz vermək.* – [Arşak:] *..İndi isə vaxtımı iyirmi nəfər yetimlə keçirib, gələcək bədbəxtliyi gözləyirəm.* M.S.Ordubadi.

**BƏDBİHESAB** *sif.* [*fars.* bəd, bi və *ər.* hesab] *dan.* Tamamilə haqsız, doğru olmayan. *Yoldaşı verdi cavab: "Danışma bədbihesab".* A.Səhhət.

**BƏDBİHESABLIQ** *is.* Tamamilə haqsızlıq, ədalətsizlik, insafsızlıq. [İsmayıl bəy:] *Doğrudan, mahalda bədbihesablıq o qədər artıbdır ki, əhalinin naləsi asimanə büländ olubdur və bu bədbihesablığa bais bizim bəylərdir.* N.Vəzirov.

**BƏDBİN** *sif.* [*fars.*] Həyatda hər şeyi pis görən, hər şeyə ümidsiz baxan, gələcəyə inanmayan. *Bədbin adam.* – *Nədənsə indi hər şey və hər kiçik təsadüf məni bədbin fikirlərə sala bilirdi.* M.S.Ordubadi.

**BƏDBİNLƏŞDİRMƏ** "Bədbinləşdirmək"dən *f.is.*

**BƏDBİNLƏŞDİRMƏK** *f.* Bədbin etmək, bədbin olmasına səbəb olmaq, həyatdan küsdürmək.

**BƏDBİNLƏŞMƏ** "Bədbinləşmək"dən *f.is.*

**BƏDBİNLƏŞMƏK** *f.* Bədbin olmaq, həyatdan küsmək. *Günəş də bunu görüb ümidini kəsir, bədbinləşir, bəxtinə lənət oxuyurdu.* Ə.Vəliyev.

**BƏDBİNLİK** *is.* Bədbin adamın əhvali-ruhiyyəsi; ümidsizlik, gələcəyə inamsızlıq, düşkün əhvali-ruhiyyə.

**BƏDBU(Y)** *sif.* [*fars.*] Pisiyli, pisqoxulu. *Zəqqum ağacının hər şaxəsində yetişmiş min cür meyvələri var ki, hamısı acı, bədbuy və şeytan başına oxşayırlar.* Ə.Haqverdiyev.

**BƏDCİNS** *sif.* [*fars.* bəd və *ər.* cins] b a x **bədəs(i)l**. *Bədnəzər qonşudan, bədcins yoldaşdan; Qədir bilənlərin iti yaxşıdır.* Aşıq Hüseyn.

**BƏDCİNSLİK** b a x **bədəsillik.**

**BƏDDUA** *is.* [*fars.* bəd və *ər.* dua] *din.* *Qarğış, nifrin, lənət..* [Şeyx Nəsrulla:] *Cəhənnəm ol! Vallahi, elə bəddua elərəm ki, yer ilə yeksan olarsan!* C.Məmmədquluzadə. [Ağa Məhəmməd xan:] *..Dul qalmış övrətlərin bədduası kimin üstünə töküləcək?* Ə.Haqverdiyev.

**BƏDƏBƏD: bədəbəd eləmək** *dan.* – sözündən qaçmaq, əhdindən qaçmaq.

**BƏDƏBƏDDƏ** *zərf dan.* Pis ayaqda, bərk ayaqda, vəziyyət çətinə düşdükdə, çıxılmaz vəziyyətə düşdükdə, əlac kəsildikdə.

**BƏDƏFKAR** *is.* və *sif.* [*fars.* bəd və *ər.* əfkar] Sui-qəsdçi, cinayətkar, cani. [Çopurov:] *Kəlbalı naməlum bədəfkar tərəfindən qəflətən vurulmuşdur.* S.Rəhimov.

**BƏDƏFKARLIQ** *is.* Cinayətkarlıq, sui-qəsdçilik, quldurluq, cinayət. *Bu mahalda baş verən cinayət və bədəfkarlıqlarda məzkurların dəst*(*i*) *.. var...* Mir Cəlal.

**BƏDƏHVAL** *sif.* [*fars.* bəd və *ər.* əhval] Əhvalı pis, halı pis, halı pozğun.

**BƏDƏXLAQ** *sif.* [*fars.* bəd və *ər.* əxlaq]

1. Əxlaqı pis, əxlaqı pozğun, əxlaqsız.

2. Pis xasiyyətli, tünd xasiyyətli.

**BƏDƏXLAQLIQ** *is.* Əxlaqı pislik.

**BƏDƏL** *is.* [*ər.*] *köhn.* 1. Bir şeyin yerini tutan və ya tuta bilən, bir şeyi əvəz edə bilən şey. *Can cövhərinə bədəldir övlad; Övlad qoyan qoyar həmin ad.* Füzuli. // Qarşılıq, əvəz, bir şeyin yerinə verilən şey.

2. Tay, bərabər, misl; nümunə, timsal. *Öylə müstəsna gözəlsən kim, sənə yoxdur bədəl.* Füzuli.

**BƏDƏMƏL** *sif.* və *is.* [*fars.* bəd və *ər.* əməl] 1. Pis işlərlə məşğul olan, pis iş görən; əxlaqsız. *Görəsən hansı bədəməllərin oduna yanırıq?* C.Məmmədquluzadə.

2. Şuluqçu, sırtıq, nadinc, pis. *Bədəməl uşaq.*

**BƏDƏN** *is.* [*ər.*] İnsan və ya heyvanın vücudu; gövdə. *Bədən üzvləri. İri bədən. Sağlam bədən. Ağ bədən.* – [Gülpəri:] *Yazığı o qədər döyübdür ki, bədənində sağ yer qalmayıb.* Ə.Haqverdiyev. *İndi ananın yarıçılpaq bədəni şaxta qarşısında müdafiəsiz qalmışdır.* Ə.Məmmədxanlı. // Məc. mənada. *Lazımdır mikrobları millətin bədənindən kənar eləmək! Yoxsa nə göz yaşı tökmək ilə azarlı şəfa tapar, nə dua yazmaq ilə.* C.Məmmədquluzadə.

◊ **Bədən tərbiyəsi** – bədən mümarisələri, idman, gimnastika, yaşayışda düzgün rejim gözləmək vasitəsilə insan bədəninin hərtərəfli inkişaf etdirilməsi və möhkəmləndirilməsi. **Bədən tərbiyəçisi** – bədən tərbiyəsi (idman) ilə məşğul olan adam.

**BƏDƏNCƏ** *is. məh.* Qısa qadın arxalığı.

**BƏDƏNCƏRƏ** *sif. dan.* Zahiri görünüş, yaxud bədən quruluşu cəhətdən pis, eybəcər, yaraşıqsız, biçimsiz, iyrənc, bədləkər.

**BƏDƏNCƏRƏLİK** *mücər. dan.* Eybəcərlik, yaraşıqsızlıq, biçimsizlik, çirkinlik, görkəmsizlik.

**BƏDƏNDAM** *sif.* [*fars.*] Bədən quruluşu düzgün olmayan, bədəninin hissələri arasında tənasüb olmayan; yöndəmsiz.

**BƏDƏNNÜMA** *sif.* [*ər.* bədən və *fars.* nüma] Adətən **bədənnüma ayna (güzgü)** şəklində işlənir – başdan-ayağa bütün bədəni göstərən böyük güzgü. [Ağa Mərdan:] *A kişi, mən sənin gözündə necə görükürəm? Qoy bir aynaya baxım.* (*Bədənnüma aynaya baxır*). M.F.Axundzadə. [Nazimə] *bədənnüma güzgü qabağında dayanıb başını darayanda, saçlarındakı ağ tükləri görəndə sinəsindən .. dərin bir ah qopurdu.* Mir Cəlal. [Qərənfil] *bədənnüma güzgünün qabağında durub, uzun qara saçlarını darayırdı.* M.Hüseyn. // *is.* Bədənnüma ayna. *Səhərdir .. gün düşür pəncərələrdən; Yanır büllur qablar, bədənnümalar.* O.Sarıvəlli.

**BƏDƏS(İ)L** *sif.* və *is.* [*fars.* bəd və *ər.* əsl] *köhn.* Əsli pis, zatı pis, mayası pis; əsilsiz, nəcabətsiz (*bəzən söyüş mənasında işlənir*). *Bədəsillər ciyərimi doğrayır; Əsil olan məlhəm qoyub bağlayır.* Aşıq Molla Cümə.

**BƏDƏSİLLİK** *is.* Əsilsizlik, nanəciblik, nacinslik.

**BƏDƏVİ** *sif.* [*ər.*] Köçəri, çöllü. *Bədəvi ərəb.*

**BƏDƏVİLİK** *is.* Köçərilik.

**BƏDFAL** *is.* [*fars.* bəd və *ər.* fal] Uğursuzluq, bədbəxtlik; fəlakət əlaməti. *Qonaqlar da bu işi şahın gələcəyi üçün bədfal hesab edirdilər.* P.Makulu.

**BƏDGU** *sif.* və *is.* [*fars.*] Başqaları haqqında pis danışan, qeybət edən. *Nəyçün sənə tənə edə bədgu; Namusuna layiq işmidir bu?* Füzuli. *Bir neçə an sükutdan sonra ona* [Ərəblinskiyə] *təsəlli vermək üçün bədgular haqqında söylənmiş bir rübai oxudum.* S.M.Qənizadə. [Yasavul:] *Yoxsa bədgu Mirzə Çopur bütün acığını bu raportda məndən alar.* S.Rəhimov. // Söyüşçü, söyüş söyən (adam).

**BƏDGULUQ** *is.* Başqası haqqında pis danışma, qeybət etmə xasiyyəti və işi.

**BƏDGÜMAN** *sif.* [*fars.*] Həqiqəti bilmədən, zənn və təxminə görə bir şey haqqında pis düşünən, pis fikirdə olan; şübhə edən. *Bildi ki, rəqib bədgümandır.* Füzuli. ☐ **Bədgüman etmək** – şübhəyə salmaq, şübhələndirmək. *Şami-vüsal xali gərək xanə qeyrdən; Şəmi keçirmə, saqın, edər bədgüman məni.* Q.Zakir. **Bədgüman olmaq** – şübhələnmək, şübhə etmək, pis fikirdə olmaq. [Şahbaz bəy:] *Şərəfnisə, doğrudan sən məndən belə bədgüman olubmuşsan!* M.F.Axundzadə. [Qazı:] *Əgər səndən bədgüman və naümid olsa idim, heç bu qədər danışığa durmaz idim sənnən.* C.Məmmədquluzadə. *Ümumən kübarlar zümrəsinə qarşı bədgüman olan .. Qəhrəmani belə bir qızı xoşlayırdı.* M.İbrahimov. **Özündən bədgüman** – özü haqqında çox böyük fikirdə olan.

**BƏDGÜMANLIQ** *is.* Pis fikir, şübhə. *Tərəhhüm qıl, tərəhhüm qıl, tərəhhüm; Başınçun eylə tərki-bədgümanlıq.* Əmani.

**BƏDHAQQ** *sif.* [*fars.* bəd və *ər.* həqq] Aldığı borcunu qaytarmaq istəməyən, haqverməz.

**BƏDHAQLIQ** *is.* Haqverməzlik. [Ustalar] *bir az əmtəələrini satdıqları tacirin bədhaqlığından danışdılar, sonra ticarətin dayandığından şikayətləndilər.* Çəmənzəminli.

**BƏDHAL** *sif.* [*fars.* bəd və *ər.* hal] Halı pis, halı ağır, vəziyyəti ağır. *Xəstə dünən bədhal idi. – Öylə bədhaləm ki, əhvalım görəndə şad olur; Hər kimin kim, dövr cövründən dili-naşadı var.* Füzuli.

**BƏDHESAB** *is.* [*fars.* bəd və *ər.* hesab] Haqsız. *Hesabiyə dağda olsa, əgilləm; Bədhesaba yaman kinligirəm mən.* “Koroğlu”.

**BƏDHEYBƏT** *sif.* [*fars.* bəd və *ər.* heybət] Qorxunc görünüşlü, pis təsir bağışlayan; dəhşətli. // Çirkin, eybəcər. *Bu bədheybət adam* [Şahməmməd] *xanın gözünə sataşdıqda, sanki xanda ona qarşı bir ikrah hissi əmələ gəldi.* Çəmənzəminli.

**BƏDHEYKƏL** *sif.* [*fars*. bəd və *ər*. heykəl] Pis görünüşlü, bədəni yöndəmsiz, biçimsiz. *Bədheykəl adam.*

**BƏDHƏRƏKƏT** *sif.* [*fars*. bəd və *ər*. hərəkət] Rəftarsız, bədxasiyyət, qılıqsız.

**BƏDXAB** *sif.* [*fars*.] Yuxusu pis. ☐ **Bədxab olmaq** – yuxusu qaçmaq. [Əkbər:] *..Səndən ayrılandan sonra gedib bədxab olub sübhədək yata bilməmişəm.* Ə.Haqverdiyev. **Bədxab etmək** – yuxusunu qaçırmaq, yatmağa qoymamaq, yuxudan ayıltmaq. [Qarovulçu:] *Hələ olur ki, xor oxuyub, yeddi qapı qonşuları bədxab eləyir.* Mir Cəlal.

**BƏDXAH** *sif.* [*fars*.] Başqasının pisliyini istəyən, heç kəsin yaxşılığını istəməyən; qərəzkar (*xeyirxah* ziddi). *Bədxah adam.* – *Bəzən oxumuş rəfiqi-bədxah; Tədbirimi çaşdırıbmış, ey vah!* M.Ə.Sabir. [Şah] *zəng edənin mütləq bədxah adam olduğu fikri ilə dəstəyi götürüb nərə çəkdi*. M.İbrahimov. // İs. mənasında. *Bədxahım olsa cümlə cəhan, çəkməzəm məlal.* Xətayi. *Aralıqda bədxah olmasa əgər; Sevgi sevgisindən olmaz mükəddər.* Q.Zakir. [Mirzə Fətəli:] *O vədə öz babalarının əməllərindən xəcalət çəkib xeyirxahları ilə bədxahlarını əlbəttə tanıyacaqlar*. Ə.Haqverdiyev. *Müəllimdən aldığımı bədxahlara satmadım.* Mir Cəlal.

**BƏDXAHLIQ** *is*. Başqasının pisliyini, yamanlığını istəmə; qərəzkarlıq (*xeyirxahlıq* ziddi).

**BƏDXASİYYƏT** *sif.* [*fars*. bəd və *ər*. xasiyyət] Pisxasiyyətli, pistəbiətli, xasiyyəti pis, yolagetməz, qılıqsız. *Bədxasiyyət adam*. – [Həkim:] *Atların xasiyyətini gözüm elə alıbdır ki, heç bir bədxasiyyət at fikrimə gətirə bilməyirəm ki, onu iki-üç günün içində öyrədib, faytona qoşa bilməyim*. C.Məmmədquluzadə.

**BƏDXƏRC** *sif.* [*fars*. bəd və *ər*. xərc] Pulunu səmərəsiz, mənasız yerə sərf edən, xərcini bilməyən; israfçı. *Bədxərc adam.* – [Cəmil] *arvadının niyə bu qədər tələbkar, bədxərc olduğuna dair suallar*(*a*) .. *cavab tapa bilmirdi*. Ə.Vəliyev.

**BƏDXƏRCLİK** *is*. Pulunu səmərəsiz və mənasız yerə sərf etmə; xərcini bilməmə; israfçılıq.

**BƏDXU** [*fars*.] *köhn.* b a x **bədxasiyyət**. *Kimsə ol bədxuyə izhar edə bilməz halımı.* Füzuli. *Ol zalimi-bədxu, şuxü sitəmkar; Zakirin halından deyil xəbərdar*. Q.Zakir. *Nə qədər gər ola bu çərxi-cəfacudə bəla; Olmaz ol qədr ki, var ol buti-bədxudə bəla.* S.Ə.Şirvani.

**BƏDİƏ** *is*. [*ər*.] Misli-bərabəri görünməmiş şey, diqqəti cəlb edən yeni icad olunmuş şey, nadir gözəl şey.

**BƏDİHƏ** *is*. [*ər*.] 1. Fikirləşmədən, qabaqcadan hazırlaşmadan söylənilən söz, şeir. // Hazırcavablıq.

2. Aşıq və bədihəçilərin hazırlamadan döşdən dedikləri mənzum parçalar.

**BƏDİHƏÇİ** *is*. və *sif.* Bədihə deyən (b a x **bədihə**).

**BƏDİHƏGU** *is*. [*ər*. bədihə və *fars*. gu] b a x **bədihəçi**.

**BƏDİHİ** *sif.* [*ər*.] *köhn.* Aşkar, bəlli, aydın. [Gülnisə:] *Sonra Sara özü-özündən vərəmlənəcəyi bədihidir.* C.Cabbarlı.

**BƏDİİ** *sif.* [*ər*.] 1. Estetik zövqə, incəsənət tələblərinə cavab verən; gözəl, qəşəng, incə, estetik. *Romanın bədii məziyyətləri. Bədii zövq. Bədii yaradıcılıq üsulu. Bədii tərtibat. Rolu bədii surətdə ifa etmək.* – [Qətibə:] *Sevgi hisslərini bədii şəkildə vermək istəyən şairlər də yanılırlar.* M.S.Ordubadi. *Xalq mahnıları xalqın da qədim zamanlardan bu günə qədər olan tarixini bədii surətdə əks etdirir.* Ə.Bədəlbəyli.

2. Həyatı surətlər vasitəsilə təsvir edən. *Bədii ədəbiyyat. Bədii əsər.* – *Sabirin qüvvətli istedadını görən qoca ustalar ona məsləhət gördülər ki, yenə vətənə qayıdıb bədii yaradıcılığa başlasın..* M.Hüseyn.

3. İncəsənətə, incəsənət sahəsində fəaliyyətə aid olan. *Teatrın bədii rəhbəri.* – *Klublarda kolxozçular bədii özfəaliyyət dərnəyinin verdiyi tamaşaya baxır və ya məruzəyə qulaq asırdılar.* Ə.Sadıq.

**BƏDİİLİK** *is*. Gözəllik, qəşənglik, incəlik, estetiklik.

**BƏDİMAN** *sif.* [*fars*. bəd. və *ər*. iman] Kafir, imansız, məzhəbsiz. *Kafirə bax, gör nə bədimandı bu! Dur qaçaq, oğlum, başayaq qandı bu!* M.Ə.Sabir.

**BƏDİR** b a x **bədr**.

**BƏDİRLƏNMƏ** "Bədirlənmək"dən *f.is.*

**BƏDİRLƏNMƏK** *f.* 1. Dolğunlaşmaq, tam dairə şəklində, on dörd gecəlik şəklə düşmək (Ay haqqında). *Ay bədirlənmişdir.*

2. *məc.* Ay kimi parlamaq, Ay kimi saf, təmiz, aydın olmaq (klassik ədəbiyyatda və xalq yaradıcılığında gözəlin surətinə işarədir). *Çıxıb on dördündə bədirlənmisən; Səni görən gedər xəyala, gözəl!* (Qoşma).

**BƏDİRLƏNMİŞ** *f.sif.* Tam dairə şəklinə düşmüş, dolğunlaşmış, on dörd gecəlik. *Bədirlənmiş Ay qalxıb, göyün bir qatında durub, bu övzaya tamaşa edirdi.* Ə.Haqverdiyev. *Göydə parladıqca bədirlənmiş Ay; Gümüş zəncir kimi görünürdü çay.* M.Seyidzadə.

◊ **Bədirlənmiş ay kimi** – on dörd gecəlik Ay kimi parlaq, təmiz, saf, ləkəsiz, aydın (bədii ədəbiyyatda gözəlin surəti buna təşbeh olunur). *Göyçəyin üzü bədirlənmiş ay kimi şəfəqli idi.* Ə.Vəliyev. [Sarıtelin] *hisli çırağın zəif işığında ala-yarımçıq görünən qaramtıl saçları, uzun hörükləri, bədirlənmiş Ay kimi yanaqları var idi.* M.Hüseyn.

**BƏDİYƏ** *is. dan.* bax **bədihə.**

**BƏDİYƏÇİ** *is. dan.* bax **bədihəçi.**

**BƏDQƏDƏM** *sif.* [*fars.* bəd və *ər.* qədəm] Ağırayaqlı, ağırayaq, qədəmi şükümsüz, ayağı düşməyən, gəlməsi guya uğursuzluğa səbəb olan.

**BƏDQƏDƏMLİK** *is.* Ağırayaqlılıq, qədəmi şükümsüzlük.

**BƏDQILIQ** *sif.* [*fars.*] Pisxasiyyət, adamlarla yola getməyən. *Bədqılıq adam.*

**BƏDQILIQLIQ** *is.* Bədqılıq adamın xasiyyəti, yola getməzlik.

**BƏDLƏKƏR** *sif.* Çirkin, eybəcər, kifir, pinti, natəmiz, yaraşıqsız.

**BƏDLƏKƏRLİK** *mücər.* Çirkinlik, kifirlik, pintilik, eybəcərlik, natəmizlik, yaraşıqsızlıq.

**BƏDLƏMƏK** *f. dan.* Bəxti gətirməmək, işi pis gətirmək, uğursuzluğa düçar olmaq.

**BƏDLİK** *is.* Pislik, yamanlıq; tərslik, nəhslik. [Novruzqulu] *başmağını çıxarmaq üçün əyildikdə, işin bədliyindən bu biri ayağı da sürüşür.* H.Sarabski.

**BƏDLÖYÜN** *sif.* [*fars.* bəd. və *ər.* lövn] Əsil mənası "bədrəng" olub, canlı dildə "pis, yaramaz, ləyaqətsiz" mənasında işlənir. *Tapdıq dünyanın ən bədlöyün .. adamı .. şəklinə düşməyə razı olardı, əsir düşməyə yox!* Ə.Əbülhəsən.

**BƏDMƏST** *sif.* [*fars.*] *köhn.* Son dərəcə kefli, bərk kefli; sərxoşluqdan özünü itirib, nalayiq hərəkət edən. *Bəli, doqquz ayın müddətində otuz doqquz nömrə məcmuə çıxartmışıq və bu otuz doqquz nömrənin içində yüz otuz doqquz çaxır içən piyan, yəni bədməst müsəlman şəkli çəkmişik...* C.Məmmədquluzadə.

**BƏDMƏZAC** *sif.* [*fars.* bəd və *ər.* mizac] Pisxasiyyətli, ağırxasiyyətli, tündməzac, yolagetməz, qılıqsız, rəftarsız. *Bədməzac adam.*

**BƏDMƏZACLIQ** *is.* Yolagetməzlik, qılıqsızlıq, rəftarsızlıq, pisxasiyyətlik; hər şeydən əsəbiləşmə, hirslənmə xasiyyəti. *Xan özü çox xoşxasiyyət nəzərə gəlirdi ki, rəiyyətlərlə bunun arasında heç bir saxtalıq, bədməzaclıq mən görmədim.* C.Məmmədquluzadə.

**BƏDMƏZHƏB** *sif.* [*fars.* bəd və *ər.* məzhəb] Heç bir dinə, məzhəbə inanmayan; dinsiz.

**BƏDMÜŞK** *is.* [*fars.*] *bot.* Müşk ağacı, söyüd fəsiləsindən dekorativ ağac. ☐ **Bədmüşk arağı** – bu ağacın çiçəyindən çəkilib, xalq təbabətində işlənən cövhər.

**BƏDNAL** *sif.* [*fars.* bəd və *ər.* nəl] Özünü nallamağa qoymayan (at, qatır və s.). *Bədnal at.*

**BƏDNAM** *sif.* [*fars.*] Pislikdə adı çıxmış, adı ləkəli, pis ad qazanmış; rüsvayçı, biabırçı. *Çaqqal var ki, gödən çıxardar, qurdun adı bədnamdır.* (Ata. sözü). ☐ **Bədnam etmək (eləmək)** – rüsvay etmək, biabır etmək. *Çün Nəsiminin muradı sənsən, ey aramican! Xalq içində anı düşmənkamü bədnam eyləmə.* Nəsimi. [Bayram:] *İndi sən istəyirsənmi ki, mən özümü bədnam edib, çuğulçuluq adını üstümə götürüm?* M.F.Axundzadə. **Bədnam olmaq** – biabır olmaq, rüsvay olmaq, adı pisliyə çıxmaq. [Xudayar bəy:] *Mən bu yaşa gəlmişdim, indiyə kimi bu cür bədnam olmamışdım.* C.Məmmədquluzadə. [Hacı Xəlil:] *..Yaman yoldaş səbəbinə insan min bəlaya düçar olar, abrusu əlindən gedər, xalq arasında bədnam olar.* Ə.Haqverdiyev.

**BƏDNAMÇILIQ** *dan.* bax **bədnamlıq.** [Hamı:] *Yox, belə iş ola bilməz; bu nə hərəkətdir, bu nə bədnamçılıqdır?* Ü.Hacıbəyov.

**BƏDNAMLIQ** *is.* Biabırçılıq, rüsvayçılıq.

**BƏDNƏZƏR** *is.* [*fars.* bəd və *ər.* nəzər] Guya gözündə başqasına xətər yetirə biləcək qüvvə olan adam. *Al-yaşıl geyinib durma qarşıda; Yayın bədnəzərdən, göz dəyər sənə.* Qurbani. *Tüklərindir ipək kimi parlaq; Bədnəzərdən vücudun olsun iraq.* M.Ə.Sabir. *Pəh, pəh, pəh! Elə bizim gənc ədibimiz əskik idi, Allah bədnəzərdən saxlasın.* C.Məmmədquluzadə. // Sif. mənasında. *Bədnəzər adam.*

**BƏDNİYYƏT** *sif.* [*fars.* bəd və *ər.* niyyət] Niyyəti, qəsdi, fikri, arzusu pis olan. *Gözəlin bəzisi bədniyyət olur; Qədrbilməz olur, bihürmət olur.* Q.Zakir. [Teymur ağa:] *Mənim atamın mərhəmətləri ona haram olsun ki, mənim haqqımda bu tövr bədniyyət olubdur.* M.F.Axundzadə. *Kimisi də beləsini danlayırdı ki, bədniyyət olma, ay qız, haqq yolunda gedənə güllə batmaz!..* Mir Cəlal.

**BƏDÖV, BƏDÖY** *is.* Sağlam, qaçağan və köhlən at. *Mən aşıq Alı dayı; Söz deyər Alı dayı; Könlü bədöv istəyən; Vaxtında alı dayı.* (Bayatı). *Qoyun bədöylər kişnəsin; Misri qılınclar işləsin.* "Koroğlu". *Bədöyün qocası olsa da arıq; Sürsən, mənzil kəsər, kəmhünər olmaz.* "Aşıq Qərib".

**BƏDR** *is.* [*ər.*] On dörd gecəlik Ay, tam dairə şəklinə düşmüş Ay. // Şairanə təşbehlərdə. *Gün-gündən edib kamalı hasil; Ol mahi-növ oldu bədri-kamil.* Füzuli. *Sanasan buluddur ənvər üzünü; Bədr Ayıtək almış qucağa zülfün.*M.P.Vaqif. *Xəcil etmiş üzü şəmsi-xavəri; Hilal edib qaşı bədri-ənvəri.* Nəbati.

**BƏDRƏFTAR** *sif.* [*fars.*] Rəftarı pis, bədqılıq, rəftarsız, yola getməyən, kobud (rəftarda). *Bədrəftar adam.*

**BƏDRƏFTARLIQ** *is.* İnsanlarla keçinməmə, yola getməmə, rəftarsızlıq, bədqılıqlıq; kobudluq (rəftarda).

**BƏDRƏĞBƏT** [*fars.* bəd və *ər.* rəğbət] Pis, rəğbətsiz, ikrah doğuran. *Amma* [Mirzə Süleyman bəy] *adını dəyişmək istəyəndə rəhmətlik atasının bədrəğbət adı mane olurdu.* B.Talıblı.

**BƏDRƏNC** *is.* [*fars.*] *bot.* Ətirli efir yağına malik bitki.

**BƏDRƏNG** *sif.* [*fars.*] 1. Xoşa gəlməyən rəngdə olan, pisrəngli, çirkinrəngli.

2. Çirkin, kifir. *Cəfər kişi qarayanız, .. seyrək bığlı, olduqca bədrəng bir adam idi.* Ə.Vəliyev.

**BƏDSİFƏT** *is.* [*fars.* bəd və *ər.* sifət] 1. Görünüşü, sir-sifəti çirkin, bədləkər. *Bədsifət bir şeytan kürəkləyib onu cəhənnəmə tullamaq istəyirdi...* "Kirpi".

2. Sərt, qaşqabaqlı, üzügülməz.

**BƏDŞƏKİL** *sif.* [*fars.* bəd və *ər.* şəkl] Pis görkəmli, çirkin, biçimsiz.

**BƏDŞÜKÜM** *sif.* Uğursuzluq gətirən.

**BƏDŞÜKÜMLÜK** *is.* Uğursuzluq, bədbəxtlik gətirmə.

**BƏDTƏR** *sif.* [*fars.*] b a x **betər**. [Heydər bəy:] *Səni toysuz aparmaq mənə ölümdən bədtər görünür.* M.F.Axundzadə. *Rəqibi vəsldə yar ilə görmək xeyli bədtərdir.* S.Ə.Şirvani. *Tuf, belə dövrana ki, bədtər olur; Seyri-fələk, dövri-zaman ilbəil!* M.Ə.Sabir. *Operettanın özündən bədtər, artistlərin oynamağı idi.* Ə.Haqverdiyev.

**BƏDUĞUR** *sif.* və *is.* [*fars.*] Bəxti gətirməyən, uğursuz, şükümsüz. *Bəduğur adam.* – [Kəndlilərdən bəzisi] *təki deyirdi, bu bəduğurların üzünü görməyim.* Mir Cəlal.

**BƏDZAT** *sif.* və *is.* [*fars.* bəd və *ər.* zat] Zatı pis, nacins, yaramaz, alçaq; hiyləgər, fitnəkar (bəzən söyüş mənasında işlənilir). [Mollabaşı:] *Çünki o məlunların əxbarı əksər ovqat nəticə bağışlayır, amma özləri yalançı və bədzatdırlar.* M.F.Axundzadə. *Ax! .. bu uşaqlar necə bədzatdılar! Lap deyəsən cin kimi bir zatdılar.* M.Ə.Sabir.

**BƏDZATLIQ** *is.* Yaramazlıq, alçaqlıq, hiyləgərlik, fitnəkarlıq, nacinslik.

**BƏHADİR** [*fars.*] b a x **bahadır**.

**BƏHADİRANƏ** *zərf* [*fars.*] İgidcəsinə, qəhrəmancasına, bahadırcasına.

**BƏHAİ** *is.* [*xüs. is.-dən*] Bəhailiyə mənsub olan adam.

**BƏHAİLİK** *is.* 1. XIX əsrin ortasında İranda əmələ gəlmiş kosmopolit bir məzhəb. (Babın şagirdlərindən biri olan Bəhaüllanın adından). [Seyid Əsədulla:] *..Siz bab və bəhailik aləmi barəsində uzun və uzadı mütaliə etməlisiniz.* M.S.Ordubadi.

2. Bu məzhəbə mənsubiyyət.

**BƏHANƏ** *is.* [*fars.*] 1. Bir iş üçün əsas ola bilən keyfiyyət, səbəb, dəlil. *Mübahisə*

*üçün bəhanə axtarmaq. – Faş oldu nəsihətin cəhanə; Sən qoymadın ortada bəhanə.* Füzuli. *Fəxrəddin qapıya yanaşmaq üçün heç bir bəhanə əldə edə bilmirdi.* M.S.Ordubadi. *Əkbər kişinin sualı bəhanə oldu, Havva küyümü çiynindən yerə qoyub çöməldi, söhbətə başladı.* Mir Cəlal.

2. Saxta, yalan, əsassız üzr. *Getməyə bəhanə axtarmaq. Bəhanə gətirmək. Bəhanəsinə qulaq asan olmadı.* – [Şərəfnisə xanım:] *Bu sözlər tamam fənn və feldir. Məni aldatmaq üçün bəhanədir.* M.F.Axundzadə ..[Kazak briqadası] *yüz cür bəhanələrlə bu vəzifənin ifasından boyun qaçırdı.* M.S.Ordubadi.

**BƏHANƏÇİ** *is.* Hər şeyə bəhanə tapan adam. *Bəhanəçiyə bəhanə əskik deyil.* (Ata. sözü).

**BƏHARİSTAN** *is.* [*fars.*] *şair*. Güllü-çiçəkli, yaşıllıq yer. *Dəbistan bir bəharistan, onun əzharı irfandır.* M.Hadi.

**BƏH-BƏH** *nida.* Tərif, bəyənmə, zövq, nəşə ifadə edir (bəzən istehza ilə deyilir). *Bəh-bəh, nə gözəl havadır! Bəh-bəh, nə ətirli güldür! Bəh-bəh, nə yaxşı səsi var!* – [Süleyman bəy:] *Bəh-bəh, nə gözəl sudur!* Ə.Haqverdiyev.

**BƏHCƏT** *is.* [*ər.*] 1. Gözəllik.

2. Şadlıq, sevinc, fərəh. *Şairəm, təbim dəniz, şeiri-tərim dürdanədir; Bəhcətim, eyşim, sürurim, vəcdim əhraranədir.* M.Ə.Sabir. *Sürücünün şərqisində vətən səsi dinlənir; Gah ruhuma bəhcət verir, gah qəlbimə qəm gəlir*. A.Səhhət.

**BƏHƏR** *is.* [*fars.*] 1. Meyvə, məhsul, bar, bəhrə. *Bu ağacın bəhəri azdır. Bu il bəhər hədsizdir.*

2. Xeyir, səmərə.

**BƏHƏRHAL** *zərf* [*fars.* bəhər və *ər.* hal] *köhn.* Hər halda, hər necə olursa olsun, hər zaman, bütünlüklə, hər vaxt. [Vəzir:] *Bəhərhal gərəkdir Şölə xanımı inandırmaq ki, Teymur ağa səndən güclü deyil...* M.F.Axundzadə. *Zənn edirəm az-az ittifaq düşsün və bəhərhal xeyli maraqlı və eşitməlidir...* C.Məmmədquluzadə. [Pristav:] *Bəhərhal siz tək möhtərəm şəxsə bu ləkəni üstünüzdən rədd etmək vacibdir.* Ə.Haqverdiyev.

**BƏHƏRLİ** *sif.* Meyvə verən, məhsul verən, bar verən; meyvə gətirmiş.

**BƏHƏRLİLİK** *is.* 1. Məhsulluluq.

2. Xeyirlilik, səmərəlilik.

**BƏHƏRSİZ** *sif.* 1. Meyvəsiz, məhsulsuz, barsız; meyvə, məhsul verməyən, bar verməyən.

2. Xeyirsiz, səmərəsiz.

**BƏHƏRSİZLİK** *is.* 1. Bəhər, meyvə, bar verməzlik, məhsulsuzluq.

2. Xeyirsizlik, səmərəsizlik.

**BƏHR**[1] *is.* [*ər.*] Vəzn (şeirdə, musiqidə). [Məşədi:] [Şerin] *üçüncü və beşinci bəndləri ayrı bəhrdədir.* M.Hüseyn. *Musiqidə səqil və xəfif səslərin vaxt etibarı ilə ardıcıl surətdə davam etməsinə metr* (*bəhr*) *deyilir.* Ə.Bədəlbəyli.

**BƏHR**[2] *is.* [*ər.*] *köhn*. Dəniz, dərya. *Bəhri-Xəzər* (*Xəzər dənizi*). – *Yaşım suyu oldu varəvarə; Bir bəhr ki, yox ona kənarə.* Füzuli.

**BƏHR**[3] [*fars.*] b a x **bəhər.** *Çəkmişik övladımızın fikrini; Ömrümüz olsa görərik bəhrini.* M.Ə.Sabir.

**BƏHRƏ**[1] *is.* [*fars.*] *tar.* Keçmiş zamanlarda mülkədarların kəndlilərdən aldıqları natural vergi (məhsul). *Tiflisdə "sirk" oyunu həmişə qışda başlanır, ondan ötrü ki, müsəlman bəyləri və mülkədarları özgə vaxt kəndlərdə rəiyyətdən bəhrə yığmağa məşğul olurlar.* C.Məmmədquluzadə.

**BƏHRƏ**[2] *is.* 1. B a x **bəhər**. *..Heydərqulu bəhrəni tamam alıb, Hacı Qara Dinməzə satıbdır...* N.Vəzirov. [Alı] *bir az əvvəl bostandan ilk bəhrə alaraq, iki araba qovun, qarpız dərib hazırlamışdı.* A.Şaiq. *Ostapenko arını saxlamağı, bəsləməyi, bəhrə tutmağı bildiyi kimi, balın və mumun mənfəətini də sayardı.* Mir Cəlal.

2. Fayda, səmərə, nəticə. *Xülasə, diplomatik danışıqlarımız bir bəhrə vermədi və biz, aydındır ki, ümidsizliyə qapıldıq*. C.Cabbarlı. ☐ **Bəhrə aparmaq** – fayda götürmək, səmərə götürmək, faydalanmaq. *Pəs aqil gərək cəmi-ləzzəti-dünyəviyyədən bəhrə aparsın...* M.F.Axundzadə.

**BƏHRƏLƏNMƏ** "Bəhrələnmək"dən *f.is.*

**BƏHRƏLƏNMƏK** *f.* Fayda götürmək, səmərə götürmək; faydalanmaq, istifadə etmək.

**BƏHRƏLİ** b a x **bəhərli.**

**BƏHRƏSİZ** b a x **bəhərsiz.**

**BƏHRƏSİZLİK** b a x **bəhərsizlik.**

**BƏHRƏYAB** *sif.* [*fars.*] *köhn.* Bəhrə götürən, fayda götürən, fayda aparan. ◻ **Bəhrəyab olmaq** *köhn.* – faydalanmaq, istifadə etmək. [Hacı Kərim:] *Cənab şair, bərfərz ki, bizim hər birimizdə bir təqsir var ki, sənətindən bəhrəhab olmur, bəs sən niyə öz sənətindən xoşgüzəran deyilsən?* M.F.Axundzadə.

**BƏHRİ** *sif.* [*ər.*] *köhn.* Dənizə, gəmiçiliyə və ya hərbi donanmaya aid olan.

**BƏHRİ-TƏVİL** *is.* [*ər.*] *əd.* 1. Əruz vəzninin bəhrlərindən biri.

2. Müəyyən vəznlərdə, lakin qəlibsiz deyilən və sonları qafiyəli olan cümlələr şəklində nəsr forması. *Sabirin bəhri-təvilləri.*

**BƏHRİYYƏ** [*ər.*] Dənizə məxsus, dənizə aid. ◻ **Qüvveyi-bəhriyyə** *köhn.* – bir dövlətin hərbi-dəniz qüvvələri, hərbi gəmiləri və s.

**BƏHRİYYƏLİ, BƏHRİYYƏÇİ** *köhn.* bax **dənizçi.** *Bəhriyyəçilərdən ibarət olan dəniz piyada batalyonu qəti hücumla düşməni .. təpədən vurub çıxardı.* Ə.Əbülhəsən.

**BƏHRİYYUN** *top.* [*ər.*] *köhn.* 1. Dənizdə, gəmidə işləyənlər.

2. Dəniz əsgərləri, hərbi-dəniz qüvvələri.

**BƏHS** *is.* [*ər.*] 1. Bir şey haqqında ətraflı danışma, müzakirə etmə, fikir yeritmə. // Söhbət, danışıq. ◻ **Bəhs etmək** – danışmaq, söhbət etmək, fikir yeritmək. *Biz bir neçə Badkubə müəllimləri .. ictimai məişətdən bəhs edən aylıq bir jurnal nəşr etməyə şüru etdik...* C.Məmmədquluzadə. **Bəhs açmaq** – söhbət açmaq, danışmağa başlamaq. *Qaragözlü həkim xanım özü bir çocuq anası olmadığı halda, kitablardan bəhs açaraq "Analıq və çocuqluq" mövzusunda mühazirə oxuyurdu.* S.Rəhimov.

2. Mübahisə, söz güləşdirmə. ◻ **Bəhs düşmək** – mübahisə düşmək. *İçərkən ortalığa belə bəhs düşdü.* S.S.Axundov. **Bəhs etmək** – 1) mübahisə etmək. *O bəhs etməyi çox sevir. – Alma, palıd, şam ağacı hal ilə; Eylədilər bəhs bu minval ilə.* M.Ə.Sabir; 2) çəkişmək, mərcləşmək; 3) yarışmaq, bəhsləşmək. *Xətti-rüxsarın edər lütfdən reyhan ilə bəhs; Hüsni-surətdə cəmalın güli-xəndan ilə bəhs.* Füzuli. **Bəhsə düşmək** – acığa düşmək, bəhsləşmək, yarışmaq. *Bəhsə düşən raykom şoferi yolda vurub Qocaoğlunun şoferini keçmiş və Dəmirovu hamıdan qabaq rayona çatdırmaq istəmişdi.* S.Rəhimov. **Bəhsə gəlmək** – bir-biri ilə yarışmaq. *Oğlanlar, qızlar, gəlinlər; Bir-birilə bəhsə gəlir.* Aşıq Əli. **Bəhsə girişmək** – 1) mübahisəyə başlamaq; 2) birinin acığına iş görməyə başlamaq, çəkişmək. **Bir-birinin bəhsinə** – 1) bir-biri ilə yarışaraq; 2) bir-birinin acığına. *Xanımlar bir-birinin bəhsinə hey buyururdular.* Mir Cəlal.

3. Bir əsərin müəyyən məsələyə həsr olunmuş hissəsi, fəsli, bölməsi. *Qrammatikanın feil bəhsi. Fizikanın işıq bəhsi.*

**BƏHSƏBƏHS** 1. *zərf* Bir-biri ilə yarışaraq, bir-biri ilə bəhsləşərək; bir-birinin acığına. *Bəhsəbəhs etmək.*

2. *is.* Yarış, yarışma. *Burada sağlam yaradıcılıq yarışı, bu sözün yaxşı mənasında, bəhsəbəhs vardı.* R.Rza.

**BƏHSLƏŞMƏ** "Bəhsləşmək"dən *f.is.*; mübahisə.

**BƏHSLƏŞMƏK** *qarş.* 1. Bir-biri ilə mübahisəyə girişmək, mübahisə etmək.

2. Yarışmaq, yarışa girişmək. *Gəl bəhsləşək, görək hansımız bu işi tez qurtararıq.*

**BƏXİL** [*ər.*] bax **paxıl**.

**BƏXİLLİK** bax **paxıllıq**.

**BƏXŞ** [*fars.*] Bağışlayan, verən, səbəb olan (adətən tərkib şəklində işlənir). ◻ **Bəxş etmək** – bağışlamaq, vermək. *Səni mənə bəxş elədi zamana; Yaxşı olan nəsib olmaz yamana.* M.V.Vidadi. *Bir insanın həyatını təmin etmək, ona yeni həyat bəxş etmək, bundan böyük nə ola bilər?* A.Şaiq. *Bir qədər də belə gəzindikdən sonra mayor Salavatın bəxş etdiyi qalın kürkünü geyib, Buxara papağını başına qoydu.* Ə.Əbülhəsən.

**BƏXŞAYİŞ** [*fars.*] bax **bəxşiş**. İnsaniyyətin mizanı səxavətdir, bəxşayişdir. N.Vəzirov. [Molla:] *Yox, əxəvi, bəxşayiş tümən-tümən, haqq-hesab dinar-dinar, – dedi.* S.Rəhimov.

**BƏXŞİŞ** *is.* [*fars.*] Bağışlanan şey, bağışlanmış şey; pay. *Ağca xanım . . atasına yazdığı məktubun içində bir şahı iriliyində zərli bir kağız da qoymuşdu ki, bu da Qara köpəyə bəxşiş olsun.* S.S.Axundov. [Mahmud:] *Bəlkə mən özümü dərvişə oxşatdığım üçün bəxşiş verəcək?* S.Rəhman. // Mükafat, hədiyyə. *İşçilərin bir qismi təşəkkür, bir qismi bəxşiş aldı.*

**BƏXT** *is.* [*fars.*] 1. Tale, qismət. *O zülf qarə qılıb bəxtimi məgər, Seyyid? Mənim əzəl də bu bəxti-qarəliyim var idi.* S.Ə.Şirvani. *Kişiyə hər şeydən qabaq bəxt lazımdır.* Ə.Haqverdiyev. *Mənim böyük düşmənim öz bəxtimdir.* M.S.Ordubadi.

2. Müvəffəqiyyət, uğur. *Onun oyunda heç bəxti yoxdur.*

3. Nisbət şəkilçisi ilə, çıxışlıq halda: **bəxtimdən, bəxtimizdən** (*ara söz*) – bir hadisə, keyfiyyət və s. münasibəti ilə məmnunluq, razılıq ifadə edir (bəzən mənfi mənada işlənir). *Bəxtimizdən hava açıldı. – Bəxtindən işıq sönməsi onun* [Qulamın] *işini daha asanlaşdırdı.* Ə.Əbülhəsən.

◊ **Bəxt ulduzu** *şair.* – bəxt simvolu. *Bir körpə tək oxşardı məni yaşlı gözəllər; Bəxt ulduzu parlaq və uzun saçlı gözəllər.* S.Rüstəm. **Bəxt əxtəri (sitarəsi)** *klas.* – b a x **bəxt ulduzu**. *Əxtəri-bəxtim vəbalin gör ki, ol məhdən gələn; Mehrlərdir özgəyə, cövrü cəfalərdir mana.* Füzuli. *Ey bəxtimin sitarəsi, bu sübh açılmasın; Mahi-rüxün yetər bu gecə karivanə, şəm!* S.Ə.Şirvani. **Bəxti ayaq üstə durmaq** – işi avand olmaq, istədiyinə çatmaq. **Bəxti açılmaq** – işi yaxşı gətirmək, işi düzəlmək, çətinlikdən, ağır və pis vəziyyətdən qurtarmaq. [Musa kişi:] *Bəlkə bu il bəxtimiz açıldı, .. ərbabın su pulunu verdim, uşaqlara əyin-baş düzəldib, bir çərək torpaq ala bildim.* M.İbrahimov. **Bəxti dönmək** – uğursuzluğa məruz qalmaq, işi bəd gətirmək, həyatında çətin və ağır dövr başlamaq. *Bəxtim dönüb, evim yıxılıb, izzətim gedib; Seyyid, o mah yar olub əğyarə, ağlaram.* S.Ə.Şirvani. **Bəxti işləmək** – b a x **bəxti gətirmək. Bəxti gətirmək** – müvəffəq olmaq, işi düz gətirmək, taleyi gətirmək. [Puan Qay] *bəxti gətirib 60-70 qəpikdən çox qazananda .. balıq da alıb şad evlərinə gələrdi.* S.S.Axundov. **Bəxti çönmək** – b a x **bəxti dönmək**. *Bəxti çönüb, çünki zəmanə dönüb; Şadü xürrəm işi fəğanə dönüb.* M.V.Vidadi. **Bəxtinə çıxmaq** – 1) yaxşı, ya pis bir şeyə təsadüf etmək, rast olmaq; 2) udmaq, aparmaq (oyunda). **Xoş bəxtiniz olsun!** – salamatlıq, xoşbəxtlik arzusunu bildirən ifadə.

**BƏXTƏBƏXT** *sif.* [*fars.*] Təsadüfi bəxt, müvəffəqiyyət ümidi ilə edilən, bəxti sınamaq üçün edilən. [Ələmdar:] *"Bəxtəbəxt" – deyə, ayırdığı qızılın hər komasını bir dəsmalına yığıb bağladı.* S.Rəhimov.

**BƏXTƏVƏR** *sif.* [*fars.*] Xoşbəxt, bəxtli, taleli. ..[Narıngül] *indi bəxtəvər həyatın meyvələrini dadmışdı.* Ə.Vəliyev. ☐ **Bəxtəvər etmək** – xoşbəxt etmək. [Bayram:] *Heç dərd eləmə, Allah qoysa ölməsəm, tezliklə səni bəxtəvər elərəm.* M.F.Axundzadə. // *İs. mənasında.* Xoşbəxt adam. – *Getmə, getmə, görüm kimin yarısan? Hansı bəxtəvərin vəfadarısan?* Qurbani. *A bəxtəvərlər, ananız gəldimi? Qondu yuva üstünə dincəldimi?* A.Səhhət. [Arvad:] *Bəxtəvərə hamı kömək eləyir, .. amma heç kəs demir ki, ala, bu da sənə ayaqqabı.* M.Hüseyn.

◊ **Bəxtəvər başın(ız)!** – bir işdə birinin bəxti gətirdikdə deyilir (bəzən istehza ilə deyilir). [Pəri:] *Bəxtəvər başımıza, pişiyimiz oğlan doğub.* N.Vəzirov. **Bəxtəvər başına** – xoşbəxtdir, xoşbəxtsən. *Bəxtəvər başına o kimsənənin; Gözəllər yanında etibarı var.* Q.Zakir. *Şahnisə xanım qızının, qarayanız çöhrəsində dolaşan fərəh və nəşəni fəxr ilə seyr edərək: – Bəxtəvər başına! – deyə gülümsədi.* Çəmənzəminli.

**BƏXTƏVƏRLİK** *is.* Xoşbəxtlik. // *Çıx. halında:* **bəxtəvərlikdən** – bikarçılıqdan, dərdsizlikdən. [Cavad:] *Dərdim var, ay başına dönüm, sirrim var, mən bəxtəvərlikdən buraya gəlməmişəm. Mirzəyə ərizə yazdıracağam.* B.Talıblı.

**BƏXTİQARA** *sif.* (bəzən "bəxtiqarə" şəklində işlənir). Bütün ömrü boyu talesiz, qaragün, əziyyət və məşəqqətlə yaşayan; bədbəxt, talesiz. *Bu qaragözlüləri bunca sevmişəm, Vahid! Nə yaxşı olmamışam bəxtiqarə, şükr olsun!* Ə.Vahid. [Nadirin] *qəlbi sındı, əhvalı pozuldu və özünün həmişə bəxtiqara* (z.) *qalacağını anladı.* B.Talıblı.

**BƏXTİYAR** *sif.* və *zərf* [*fars.*] Xoşbəxt, bəxtli. *Bəxtiyar adam. Bəxtiyar olmaq. Bəxtiyar yaşamaq. – Avqustun axırında bu bəxtiyar ailə ilə əlvida edərək Bakıya qayıtdım.* S.S.Axundov. *Aslan çox çalışqan olduğu üçün hər gün öz ruzisini qazanıb külfəti ilə bərabər bəxtiyar yaşayırdı.* C.Cabbarlı.

*Əsəd də müəlliminin yanında sözünün düz çıxdığından bəxtiyar bir uşaq kimi gülümsünüb durmuşdu.* B.Talıblı.

**BƏXTİYARLIQ** *is.* Xoşbəxtlik. *Burnaşov Yekaterinanın .. Tiflisə qoşun göndərməkdə heç bir istila fikrində olmadığından, yalnız əhalinin asayiş və bəxtiyarlığını istədiyindən bəhs edib, əsil mətləbə keçdi.* Çəmənzəminli. *Bu müqəddəs təbiətin saf şeriyyəti; İnsanlığı dəvət edir bəxtiyarlığa!* S.Vurğun.

**BƏXTLİ** *sif.* Taleli, xoşbəxt, bəxtəvər; bəxti gətirən, istədiyinə nail olan. *Bəxtli adam.*

**BƏXTSİZ** *sif.* Talesiz, bəxti gətirməyən, uğursuz, bədbəxt. *"Bəxtsiz cavan"* (*Ə.Haqverdiyevin pyesinin adı*).

**BƏXTSİZLİK** *mücər.* Talesizlik, uğursuzluq, bəxti gətirməyən adamın halı.

**BƏXUR** [*ər.*] b a x **buxur.**

**BƏİSTİLAH...** [*fars.* be və *ər.* istilah] *köhn.* Adətən tərkiblərdə işlənir. ...dilində, ...dilincə, ...dilində desək, ...demişkən, ...deyildiyi kimi. *Bir para müsəlman müəllimlərinin canına bir cin müsəllət olub ki, yoldaşları öz aralarında hər nə deyir, .. haman cin gedib qorodovoya .. xəbər verər, yani bəistilah*(*i*)*-rus şpionluq edir.* C.Məmmədquluzadə.

**BƏKARƏT** *is.* [*ər.*] 1. Bakirəlik, qızlıq.

2. *məc.* Təmizlik, saflıq.

**BƏKÇİ** *sif.* Qoruyucu, mühafizəçi, baxıcı, gözətçi, keşikçi. *Ax, siz, a zəncir, a zəncirlərim! Siz də dəmir bəkçisiniz hər zaman.* A.Səhhət. [Qorxmaz:] *Qardaşlar, biz dustaq bəkçisini sarıyıb qaçacağıq.* C.Cabbarlı. *Baxın dövrənizə bizim bəkçilər!* M.Rahim.

**BƏKÇİLİK** *is.* Gözətçilik, keşikçilik.

**BƏKLƏMƏ** "Bəkləmək"dən *f.is.*

**BƏKLƏMƏK** *f.* 1. Mühafizə etmək, qorumaq, keşiyini çəkmək. *Bizə çün qədr bulunmaz, çıxalım dünyadan; Müştəri yox, necə bir bəkləyəlim bazarı.* Füzuli. *Naşı ovçu bərə bəklər, əylənər; Marallar sayrışır yollara doğru.* Qurbani. *Əhli-halın bəzminə huşyar olan layiq deyil; Bəkləyən meyxanə qapısın bu cənnət babidir.* Qövsi.

2. Gözləmək. *..Nabat xala yavaş-yavaş qazanıb, evin məxaricini təmin edir və iqtisadi ehtiyacı olmadığından oturub, özünə adlı-sanlı bir kürəkən bəkləyirdi.* B.Talıblı. *Hardasan, gözlərim həp səni bəklər; Bax, övladın necə giryandır, ana!* S.Vurğun. [Bülənd] *Sonadan bəklədiyini görmürdü.* Ə.Əbülhəsən.

**BƏKMƏZ** *is.* Bəzi şirin meyvələrin suyundan çəkilən şirə; doşab. *Üzüm bəkməzi. Əncir bəkməzi. Tut bəkməzi.*

**BƏKTAŞİ** *is.* və *sif.* XV əsrdə İranda meydana çıxıb, sonralar Yaxın Şərqdə yayılmış müsəlman dini təriqətlərindən birinin adı (bu təriqətin müəssisi olan Hacı Bektaş Vəlinin adından). // *məc.* Qeydsiz, laübalı, xərabati adam. *Surətdə gərçi bəktaşi çoxdur Nəsimitək; Mənidə adı hər həcərin kimya deyil.* Nəsimi.

**BƏKTAŞİLİK** *is.* Bəktaşi təriqəti və bu təriqətə mənsubiyyət.

**BƏQA** *is.* [*ər.*] *klas.* Baqilik, əbədilik, həmişəlik, ölməzlik. *Seyyid, elə bildim ki, bəqa suyunu içdim; Ol lalərüxün qətlimə fərmanını görcək.* S.Ə.Şirvani. *Füzulinin əşar və kəlamının bəqasına ikinci səbəb onların elm və təcrübə üzü ilə təbi-səlimdən doğub vüquə gəlmələridir.* F.Köçərli.

**BƏQƏDRİ...** [*ər.*] *köhn.* Aşağıdakı tərkiblərdə işlənir: **bəqədri-qüvvə** – qüvvə çatdıqca, güc çatdıqca, imkan daxilində. [Biz] *hər bir şairin məsləkini, üslubi-kəlamını və öz əsr və zəmanasının təqazasınca nə növi əsərlər vücuda gətirdiyini .. bəqədri-qüvvə açıb göstərmişik.* F.Köçərli. [Tahirzadə:] *Suallarınıza bəqədri-qüvvə cavab verməyə hazıram.* Mir Cəlal; **bəqədri-imkan** – imkan daxilində; **bəqədri-lüzum** – lazım olduqca, lazım gəldikcə, ehtiyac olduqca, lazımi surətdə. [Ağa Mərdan:] *İndi durum gedim, məhkəmədə olan haşiyənişinləri püxtə və amadə edim ki, sabah mürafiə vaxtında bəqədrilüzum quyruq bulasınlar.* M.F.Axundzadə; **bəqədri-məqdur** – imkan daxilində, vəziyyətdən asılı olaraq. *Qalan artistlər hamısı bəqədri-məqdur rollarını keçirtdilər.* Ə.Haqverdiyev.

**BƏQƏRƏ**[1] *is.* [*ər.*] Quran surələrindən ikincisinin adı.

**BƏQƏRƏ**[2] *is.* Keçmişdə quyudan su və neft çəkmək üçün işlədilən təkərəoxşar fırlanan qurğu. [Atabala:] *Səhərdən axşama qədər atı bəqərəyə qoşub neft çəkirdim.* A.Şaiq.

**BƏQİYYƏ** *is.* [*ər.*] *köhn.* 1. Artıq qalan şey, qalıq.

2. Ard, geri, mabəd.

3. Məhv olmuş şeyin qalmış hissəsi, qalıqları. *Dağılmış köhnə bir binanın bəqiyyəsi.*

**BƏLA** *is.* [*ər.*] 1. Uğursuzluq, bədbəxtlik, müsibət, fəlakət, afət. *Ona bəla üz verdi. – Bu nə bəladır ki, .. dağlar və daşlar da quraqlıqdan od tutub yanır.* C.Məmmədquluzadə. *..Kiçik bir xata böyük bəlalar törədər.* M.İbrahimov. // Məc. mənada. [İrakli:] *Ümidvaram ki, Gürcüstanın, İmeretiyanın və bizim sair qonşumuz xanların qoşunu ilə birləşib, bu gələn bəlanı tezlik ilə dəf edək..* Ə.Haqverdiyev. *On nəfər polis ədibin qapısını açıb bəla kimi içəri soxuldu.* Mir Cəlal.

2. Qəm, qüssə, kədər, dərd, əzab, iztirab. *Bəladan xali olmaz aləm içrə aşiqi-sadiq.* S.Ə.Şirvani. ☐ **Bəla çəkdirmək** – zülm etmək, əziyyət vermək, çox incitmək. **Bəla çəkmək** – müsibət və məşəqqət görmək, çox ağır hallar keçirmək. **Bəlasını çəkmək** – əziyyətinə dözmək, qatlaşmaq, əziyyətini çəkmək. *Əzəldən canımı eşqin yolunda çün qoymuşam; Bəlasını çəkərəm, dönməzəm bəlasından.* Nəsimi. **Bəlaya düçar olmaq** – fəlakətə məruz qalmaq. **Bəlaya düşmək** – əziyyətə, müsibətə məruz qalmaq, xataya düşmək, çətin vəziyyətə düşmək. *Əgərçi zülfünə dami-bəla demiş aqil; Bu damə kim ki, gəlib düşmədi, bəlayə düşər.* Nəsimi. **Bəlaya salmaq** – müsibətə salmaq, çətin vəziyyətə salmaq. *Zəmanə zülfü rüxündən bəlayə saldı bəni; Həm ol zəman ki, seçildi qərası ağından.* Nəsimi. **Bəlayi-müsibətlə** – çox çətinliklə, böyük çətinlik və əziyyətlə. *Bir bəlayi-müsibətlə bunun* [Fərəcovun] *qrimini təmizləyib, şad-xürrəm hamı öz evinə getdi.* H.H.Sarabski. **Bəlayi-nagəhan** – gözlənilməz bəla, afət (bəzən məcazi mənada işlənir). *Bu prokuror ki, görürsünüz, bir vaxt N. qəzasının bəlayi-nagəhanı idi.* Ə.Haqverdiyev.

◊ **Başa bəla kəsilmək** – daima incitmək, gözümçıxdıya salmaq, daim əngəl törətmək. ..[Varis] *tələbələrin başına bəla kəsilmək, onları təhqir etməkdən zövq alırdı.* A.Şaiq. **Başına bəla açmaq** – əngələ salmaq, çıxılmaz vəziyyətə salmaq, əngəl törətmək. *Bir sərraci-birütbəni gətirib özümüzə padşah qayırdıq, başımıza bəla açdıq.* M.F.Axundzadə. *Katibin Sübhanverdizadəyə ötən günü hilli-mixəkli çay verməyi indi onun başına böyük bir bəla açmış oldu.* S.Rəhimov.

**BƏLADİDƏ** *sif.* [*ər.* bəla və *fars.* didə] *köhn*. Bəla görmüş, bəla çəkmiş, başına bəla gəlmiş; çoxlu bəla və müsibət görməklə təcrübə və sınaqdan çıxmış (adam). *Torpaq qarışıb daşlara, evlər mütəlaşi; Xaki-siyəh ətfali-bəladidə fəraqi.* A.Səhhət.

**BƏLAĞƏT** *is.* [*ər.*] Fikrini gözəl, aydın, düzgün və inandırıcı sözlərlə ifadə etmək qabiliyyəti; natiqlik istedadı. *Onun danışığında bir bəlağət var. – Oğlanın qəzəlpərəst atası .. barmağını mənə tərəf uzadıb başladı bəlağətlə* (*z.*) *oxumağa.* C.Məmmədquluzadə. [Əmiraslan:] *Siz də o fəsahət, bəlağət qapısı olan ağzınızı açıb camaatı bizim itaətimizə çağıracaqsınız.* S.S.Axundov. [Rəhim xan:] *Sənin ağıl, kamal, fəsahət və bəlağətin mənim nəzərimi cəlb etdi.* C.Cabbarlı. // Gözəllik, bədiilik, aydınlıq (danışıqda).

**BƏLAĞƏTLİ** *sif.* 1. Fikrini gözəl, düzgün, aydın və inandırıcı sözlərlə ifadə edə bilən, natiqlik istedadına malik olan.

2. İnandırıcı, gözəl və aydın bir surətdə ifadə edilmiş (nitq, ifadə və s.).

**BƏLAKEŞ** *sif.* [*ər.* bəla və *fars.* ...keş] b a x **bəladidə.** *Hər yan dedilər ki, ey bəlakeş! Gül çağıdır, olmagil müşəvvəş!* Füzuli.

**BƏLALI** *sif.* 1. Əziyyətli; əzablı; iztirab və məşəqqətlə dolu. *Bəlalı iş. – Kərəm kimi nə bəlalı başın var; Alvaz dağı, heç əskilməz dumanın.* Aşıq Kərəm. *Canlandı gözlərində bəlalı ağır illər.* M.Rahim.

2. Müsibət və əziyyət çəkmiş, ağır günlər keçirmiş; uğursuz, bədbəxt. *O şair mədh edir min bir gülzarı; Bəlalı aşiqi, sevdalı yarı.* S.Vurğun.

**BƏLƏD** [*ər.*] 1. *sif.* Bir adam, iş və s. ilə yaxşı tanış olan: bilən, yetik. *O bu yerlərə bələd adamdır.* – [Gülbahar:] *Dadaş, .. sən dediyin adamların heç birinə mən bələd deyiləm.* C.Məmmədquluzadə. ☐ **Bələd olmaq** – tanış olmaq, aşna olmaq, tanımaq, bilmək. [Bəkir:] *Yola bələd olandan sonra elə bir ayağım burada olacaq*. N.Vəzirov. [Zaman:] *Amma indi özünüz arvadların*

*xasiyyətlərinə bələdsiniz.* Ə.Haqverdiyev. *Maral çoxdan bələd olduğu cığırla suya endi.* M.Hüseyn.

2. *is.* bax **bələdçi.** *Görünən yola nə bələd.* (Ata. sözü). *Aman lələ, yada düşdü vətənim; Bələd yoxdur göstərəydi yol mənə.* Aşıq Kərəm.

**BƏLƏDÇİ** *is.* Yol göstərən; bir yerin, şəhərin və s.-nin yolunu, ətrafını yaxşı tanıyan adam. [Əmiraslan ağa:] *Bələdçi olmasa qoşun bir şey edə bilməz.* S.S.Axundov. *Səfəri bələdçi aparmışdılar. Səfər axşam Kürü o taya keçib, səhər tezdən qayıtdı, Şamxalın üç min ləzgi ilə irəlilədiyini xəbər gətirdi.* Çəmənzəminli.

**BƏLƏDÇİLİK** *is.* Bələdçinin işi. ☐ **Bələdçilik etmək** – qabağa düşüb yol göstərmək. [Qacar:] *Yaxşı, qoşul bizə, bizimlə də get; Bu vəhşi dağlarda bələdçilik et!* S.Vurğun. *Səlim .. yağışa düşmüş bir şəhərliyə bələdçilik etdiyini danışdı.* Mir Cəlal.

**BƏLƏDİYYƏ** *is.* [*ər.*] Şəhər, rayon, kənd kimi yaşayış məntəqələrində abadlıq, təmizlik, kommunal və s. xidmətlərə baxan, üzvləri xalq tərəfindən seçilən idarə. *Bələdiyyə rəisi. Bələdiyyə idarəsi.*

**BƏLƏDİYYƏLƏŞDİRİLMƏ** "Bələdiyyələşdirilmək"dən *f.is.*

**BƏLƏDİYYƏLƏŞDİRİLMƏK** *məch.* Xarici şəxslərin əlindən alınıb, bələdiyyə və ya kənd idarəsi ixtiyarına verilmək.

**BƏLƏDİYYƏLƏŞDİRİLMİŞ** *f.sif.* Bələdiyyə və ya kənd özünüidarə təşkilatı ixtiyarına verilmiş (bax **bələdiyyələşdirilmək**).

**BƏLƏDİYYƏLƏŞDİRMƏ** "Bələdiyyələşdirmək"dən *f.is.*

**BƏLƏDİYYƏLƏŞDİRMƏK** *f.* Torpaq və mülkləri xüsusi şəxslərin əlindən alıb, bələdiyyə və ya kənd özünüidarə təşkilatı ixtiyarına vermək.

**BƏLƏDİYYƏT** *is.* [*ər.*] Bələdlik, tanışlıq, bələd olma, yaxından tanış olma. *Məlum oldu ki, qəvaidi-təcvidə külli bələdiyyəti var imiş.* M.F.Axundzadə. [Mirzə:] *Xidmətlərinə çata bilməmişəm, amma bələdiyyətim var, alim adamdır.* Ə.Haqverdiyev.

**BƏLƏDLƏMƏ** "Bələdləmək"dən *f.is.*

**BƏLƏDLƏMƏK** *f.* 1. Bir yeri, yolu və s.-ni öyrənmək, tanış olmaq, nişanlamaq, gözaltı eləmək. *Partizanlar düşmənin mövqelərini qabaqcadan bələdlədilər.* – *Lotubaşı ertədən yolu bələdləyib xəzinənin yarılmasını axşama qoydu.* "Aşıq Qərib". [Gəldiyev] *məhəccərin üstünə qalxmamış, düşmək üçün əl yeri, ayaq yeri bələdlədi.* Mir Cəlal.

2. Bələd etmək, tanış etmək, göstərmək.

**BƏLƏDLİK** *is.* Tanışlıq, aşnalıq; yetiklik. *Bu işə bələdliyim yoxdur.* – [Nəriman:] *Döyüş işinə nəzəri cəhətdən o qədər bələdliyim yoxdur.* Mir Cəlal.

**BƏLƏK** *is.* 1. Körpə uşağı bələməyə məxsus sarğı, qundaq. *Dürdanə xanım dad təpdi ki, mənim qızım hələ körpədir; nə bilim, bələkdən təzə çıxıb.* Ə.Əbülhəsən. [Şair] *içəri girib, Afaqın başı yanındakı kiçik bələyə yaxınlaşdı.* Ə.Məmmədxanlı.

2. *Çıx. halında:* **bələkdən** – lap körpəlikdən, uşaqlıqdan. [Qarı:] *Vallah, deyəsən ki, onun bu savaşdan ölən oğluna guya mən bələkdən nişanlıymışam.* S.Rəhimov.

**BƏLƏKBAĞI** *is.* Uşağın bələyini bağlamağa məxsus bağ; qundaqbağı.

**BƏLƏKLƏMƏ** "Bələkləmək"dən *f.is.*

**BƏLƏKLƏMƏK** *f.* 1. Bələyə bürünmək.

2. Bax **bələmək.**

**BƏLƏKLƏNMƏK** bax **bələnmək**[1].

**BƏLƏKLİ** *sif.* Bələyə sarılmış, bələklənmiş, qundaqlanmış. [Salman] *bələkli körpəni yavaşca hər iki əlinin üstünə götürdü.* S.Rəhimov. *Bələkli iki körpə baş-ayaq nənnidə yatırdı.* M.İbrahimov.

**BƏLƏKÜN** *is. bot.* Birillik ot bitki. *Bələkün .. üzəri sıx tüklərlə örtülü bozumtul yaşıl rəngli birillik bitkidir.* Qədirov.

**BƏLƏMƏ** "Bələmək"dən *f.is.*

**BƏLƏMƏK** *f.* Körpəni sarğı ilə sarımaq, bələyə bükmək, qundaqlamaq. *Sona sevə-sevə, oxşaya-oxşaya qızı Məryəmi bələyirdi.* A.Şaiq.

**BƏLƏN** *is. məh.* Dağ döşündə tala. *Bələndən endim düzə; Su bağladım nərgizə.* (Bayatı). *..Eyvaz Koroğluynan bərabər qoyunları hayladı, bələndən aşırdı.* "Koroğlu".

**BƏLƏNMƏ** "Bələnmək"dən *f.is.*

**BƏLƏNMƏK**[1] *məch.* Bələyə bükülmək, sarğı ilə sarınmaq, qundaqlanmaq.

**BƏLƏNMƏK**[2] bax **bələşmək.** *Bal bələnib dillərinə, gül sancılıb tellərinə.* Aşıq Əli.

*Qənd əzilib dilə, dişə, dəhanə; Qaymaq dodaqlara bal bələnibdir.* Aşıq Ələsgər.

**BƏLƏŞMƏK** *f.* Bulaşmaq, bulanmaq. *Canım qoydum yar yolunda sadağa; Bal bələşib dilə, dişə, dodağa.* Aşıq Abdulla.

**BƏLGƏ** *is. etnoqr.* 1. El arasında evlənən oğlan tərəfindən qız evinə göndərilən birinci nişan – üzük və örpək.

2. *məh.* Əkin yerlərinin hüdudunu göstərən nişan, mərz.

3. *məc.* Bəhanə, səbəb, dəlil, tutarğa. *Əlində bəlgə etmək.*

4. *məh.* Vuruşma zamanı qorunmaq üçün qola sarınan sarğı.

**BƏLGƏLƏMƏ** "Bəlgələmək"dən *f.is.*

**BƏLGƏLƏMƏK** *f. dan. köhn.* 1. Bəhanə və üzr gətirmək, əldə dəstavüz etmək.

2. Köhnə məişətdə: nişan göndərmək, nişanlamaq.

3. Hüdud qoymaq, əkin yerinin hüduduna nişan qoymaq.

**BƏLGƏLƏNMƏK** *məch. köhn.* 1. Nişanlanmaq.

2. Hüdud qoyulmaq, nişan qoyulmaq, mərz qoyulmaq (əkin yerinə).

**BƏLĞƏM** *is.* [*ər.*] Ciyərdən, yaxud nəfəs yollarından gələn qatı selikli, yaxud irinli ifrazat; hayqırıq.

**BƏLĞƏMİ** *sif.* [*ər.*] Key, ağırtərpənən, hər şeyə laqeyd baxan; fleqmatik (xasiyyət).

**BƏLĞƏMLİ** *sif.* 1. Bəlğəmlə dolu, içərisində bəlğəm olan. *Bəlğəmli sinə. Bəlğəmli tüpürcək.*

2. Bəlğəmə bulaşmış, bəlğəmlənmiş. *Bəlğəmli yaylıq.*

**BƏLĞƏMMİZAC** *sif.* [*ər.*] Ağır, süst, soyuqqanlı. *Bəlğəmmizac adam.*

**BƏLĞƏMOTU** *is. bot.* Dərman hazırlanan çoxillik bitki. [Bəlğəmotunun] *üst kökləri kökümsü gövdə ilə tamamlanır. Yerüstü gövdələri isə yerin altında topa, dəstə şəklində xaricə çıxıb, adətən qol-budaq vermir.* Əliyev.

**BƏLİ** *əd.* 1. Verilən suala müsbət cavab və ya təsdiq üçün işlənilir; hə, elədir; (*yox* ziddi). [Şəhrəbanı xanım:] *Bəli, baba dərviş çox razı oldum.* M.F.Axundzadə. *Salman düşündü və: – Nə faciədir o? – dedi. – Üsyan günlərinimi deyirsən? – Üsyan günlərini, bəli, üsyan günlərini.* H.Nəzərli. [Piri baba:] *Bəli, qızım, qarışqaların toyudur.* S.S.Axundov. *Bənna güldü, – bəli, – dedi, – gərək tələsək.* Ə.Cəmil.

2. Çağırışa nəzakətli cavab. *Əhməd! – Bəli!*

3. Anlaşılmayan bir sözü təkrar etdirmək üçün sorğu yerində işlənir. – *Bəli, nə dediniz, eşitmədim.*

4. Danışılanlara yekun vurmaq, ya fikirdə olan şeyləri xülasə etmək üçün söylənir. *Bəli, atları gətirdilər və minib, Təbrizdən çıxıb, üz qoyduq Araz kənarına tərəf hərəkət etməyə.* C.Məmmədquluzadə.

5. Bəzən təəssüf, yaxud kinayə, narazılıq ifadə edir. *Bəli, ömrümüzdən bir il də getdi! Bəli, əlli beşinci il də belə getdi! Bəli, bu da bu yandan çıxdı!*

**BƏLİM** *is.* Darı, çəltik, buğda və s. bitkilərin küləşi; həşəm.

**BƏLİRMƏ** "Bəlirmək"dən *f.is.*

**BƏLİRMƏK** *f.* Bəlli olmaq, zahir olmaq, görünmək. *Qadının dodaqlarından acı bir təbəssüm bəlirdi.* S.Hüseyn.

**BƏLİRTMƏK** *f.* Bəlli etmək, zahir etmək, açıb göstərmək.

**BƏLKƏ** *bağl.* 1. Ola bilər, ola bilsin, ehtimal, şayəd, ola ki, olsun ki. *Bəlkə bu gün axşam yağış ara verdi.* – [Fəxrəddin:] *Bəlkə mən tez qayıtdım. Başqasını götürməyin.* M.S.Ordubadi. *Cuma düşündü ki, bəlkə .. Marala onun haqqında bəzi şübhəli şeylər demişlər.* Ə.Əbülhəsən.

2. İrəlidə söylənmiş fikrin əksini ifadə edir. *Məsələ sən deyən kimi deyil, bəlkə mən deyən kimidir.*

3. Hətta, heç. *Bu işi bir günə deyil, bəlkə iki günə görüb qurtarmaq olmaz.*

4. "Də" ədatı ilə: **bəlkə də** – tərəddüd, şübhə, qeyri-müəyyənlik ifadə edir. *Bəlkə də, sən deyəndir.* – [Atabəy:] *Mələkə, səni bir başqası üçünmü saxlamışdır? Səba xanım utanaraq, yavaşcadan dedi: – Bəlkə də.* M.S.Ordubadi.

**BƏLLƏMƏ** "Bəlləmək"dən *f.is.*

**BƏLLƏMƏK** *f.* 1. Bəlli etmək, aydınlaşdırmaq, bilmək.

2. Nişanlamaq, gözaltı etmək, bələdləmək. *Tərlan kimi gözlərini zillədi; Dağ başından evin səmtin bəllədi.* A.Səhhət. [Pol-

kovnik] *ona* [təyyarəçiyə] – *Bizim topların yerini bəlləmək lazımdır, – dedi, – belə hallarda yaxşı gizlənmək məsləhətdir.* M.Hüseyn. *Ertəsi gün səhər tezdən Tapdıq bəllədiyi kolluqda deyəsən bir qaraltı görən kimi oldu.* Ə.Əbülhəsən.

3. Nişanəyə almaq. *İlyas otlar arasından baxıb, ağac başındakı "qarğaları" bəllədi, atəş açmağa icazə istədi.* Mir Cəlal.

**BƏLLƏNMƏ** "Bəllənmək"dən *f.is.*

**BƏLLƏNMƏK** *f.* Görünmək, aşkar olmaq, aydın olmaq, bilinmək, tanınmaq. *Rəmz anlayan, söz düşünən, dərd bilən; Aləmlərdə şöhrətlənir, bəllənir.* Qurbani. *Mərd igidlər yarasından bəllənər; Namərdləri qoy tər bassın, xar olsun!* "Koroğlu".

**BƏLLƏTMƏ** "Bəllətmək"dən *f.is.*

**BƏLLƏTMƏK** *f.* Bildirmək, açmaq, üzə çıxarmaq. [Nəriman] *təkrar güllə atıb, yerini bəllətməkdən qorxdu. Yerə sıxılıb diqqət elədi.* Mir Cəlal.

**BƏLLİ** *sif.* Aydın, aşkar, məlum, meydanda olan. *Bəlli məsələ.* // Xəbər şəkilçisi ilə: **bəllidir** – aydındır, məlumdur, aşkardır, görünür. *Dudkeş kimi bir papaq başında; Ağ tükləri bəllidir qaşında.* M.Ə.Sabir. *Əzəldən böyükdür gözəl vətənin; Dünyaya bəllidir şöhrətin sənin.* S.Vurğun. *Mötəbər mənbələrin verdiyi məlumatdan bəllidir ki, 1735-ci ildə bugünkü Balaxanıda neft verən 52 quyu varmış...* M.Hüseyn. ☐ **Bəlli edilmək** – aydınlaşdırılmaq, aşkara çıxarılmaq. **Bəlli etmək** – aydın etmək, aşkar etmək, aydınlaşdırmaq, zahirə çıxarmaq, üzə çıxarmaq, meydana çıxarmaq. **Bəlli olmaq** – aydın olmaq, aşkar olmaq, zahirə çıxmaq, zahir olmaq, bilinmək, müəyyənləşmək, müəyyən olmaq. *Şəhərdən gətirdiyim toyuğumun balaları böyümüş, tüklənmiş, xoruzu, fərəsi bəlli olmuşdu.* A.Şaiq. [Mirzə Səməd:] *Mənəm ana, qapını aç, – dedikdə qapını açmaq üçün anasının gəldiyi bəlli oldu.* M.S.Ordubadi. // Tanış, tanış olan. *Bu halda evin qapısı açıldı və pristavın bəlli səsi onun* [Məhərrəmin] *beynində müdhiş bir zərbə ilə çınladı.* H.Nəzərli.

**BƏLSƏM** *is.* [*ər.* əsli *yun.*] İsti ölkələrdə bitən və yarpaqlarından efir və qatran alınan qara ağac. // Bu ağacdan hasil edilən yağ, şirə (b a x **balzam**).

**BƏM** *is. mus.* Musiqidə yoğun (aşağı) səs (*zil* müqabili). *Azərbaycan musiqisində böyük tersiya temperasiya tersiyasına nisbətən qısa* (*bəm*), *kiçik tersiya isə temperasiya tersiyasına nisbətən geniş* (*zil*)*dir.* Ü.Hacıbəyov. *Melodiya, bir-biri ilə qarşılıqlı münasibətdə olan ayrı-ayrı səslərdən düzəlir. Bu səslər bir-birinə nisbətən zil* (*yüksək*) *və bəm* (*aşağı*) *olur.* Ə.Bədəlbəyli. [S.Şuşinski] *həm bəm səsdə* (*pəsdən*), *həm orta səsdə* (*miyanəxan*) *və həm də zildə* (*zilxan*) *məharətlə oxuyur.* A.Gəray.

**BƏMBƏCƏ** *is. dan.* Pəncə. *Zor ilə şikarı əlimdən aldı; Özümə də bir bol bəmbəcə çaldı.* Q.Zakir.

**BƏMBƏCƏLƏMƏK** *f. dan.* Qamarlamaq, qamarlayıb almaq, pəncəsinə keçirmək.

**BƏMBƏYAZ** *sif.* Ağappaq. *Qarlı, qartallı bir yığın dağlar; Ta uzaqlardan bəmbəyaz parlar.* H.Cavid. *Bəmbəyaz qar kimidir, bəlkə də qardan ağdır.* S.Rüstəm.

**BƏMLƏŞDİRMƏ** *mus.* "Bəmləşdirmək"dən *f.is.*

**BƏMLƏŞDİRMƏK** *f. mus.* Alçaq səslə (bəmlə) çalmaq, səsini alçaltmaq.

**BƏN** b a x **mən.**

**BƏND[1]** *is.* [*fars.*] 1. *anat.* Skelet sümüklərinin oynaq yerləri; buğum, məfsəl. *Barmaqların bəndləri. Bəndləri ağrımaq. Bəndləri qırılmaq.* – [Qazan xan] *başında, bədəninin bəndlərində bir ağırlıq və sızıltı duydu.* M.Rzaquluzadə.

2. Müxtəlif hissələrdən ibarət olan şeyin hissələrini bir-birinə rəbt edən, bağlayan, bərkidən bağ və s. *Qamışın bəndləri. Borunun bəndləri aralandı.* // Sınmış, aralanmış, qopmuş bir şeyi bərkitmək üçün ona keçirilən halqa, sarğı və s.

3. Ümumiyyətlə, bağ, ip, düyün. *Ol türfə qəzalın açdı bəndin; Şad eylədi canidərdməndin.* Füzuli. *Aç kiseyi-səxavətüvün bəndin, ey qəni.* M.Möcüz. *..Sona hərdən onun* [Ceyranın] *bəndini açıb həyətə buraxırdı.* Mir Cəlal. // Məc. mənada. *Damizülfün bəndinə mürği-giriftarəm hənuz.* Xətayi. ☐ **Bənd edilmək** – bağlanmaq, rəbt edilmək, birləşdirilmək, keçirilmək, ilişdirilmək. **Bənd etmək** – bağlamaq, rəbt etmək, ilişdirmək. *Milis nəfəri öz atını ağaca*

*bənd etdi və asanlıqla üzüaşağı sallandı.* S.Rəhimov.

4. Ayrı-ayrı hissələrdən ibarət olan bir şerin bir parçası. *Şerin birinci bəndi. – Kupletlər bir-birindən nəqarət vasitəsilə ayrılır, hər bənddən sonra təkrar edilən nəqarətin musiqisi və bəzən sözləri də dəyişdirilmədən olduğu kimi saxlanır.* Ə.Bədəlbəyli.

5. Qanun məcəlləsinin, yaxud hər hansı bir mətnin, sənədin və s.-nin rəqəm və ya hərflə ayrılan kiçik hissəsi, maddəsi. *Qanunun 3-cü fəslinin "D" bəndi. Müqavilə üç bənddən ibarətdir. Qərarın üçüncü bəndində belə yazılmışdır. – Müştərilərə üzümüzü tutub, onlara etdiyimiz nəsihətlərin birinci bəndi budur.* C.Məmmədquluzadə.

6. Bir yeri seldən, daşqından qorumaq, yaxud suyun (arxın, kanalın) kənara axmasının qabağını almaq üçün çəkilən sədd. *Bənd çəkmək. – Axırda o bənd ki, suyun qabağını kəsmişdi və suyu axmağa qoymurdu, rəxnə tapar və su mürur ilə bəndi uçurub aparar.* H.Zərdabi. [Xanmurad:] *Sementlədiyimiz bəndi su yuyub aparıb.* İ.Əfəndiyev. *Hər tərəfdə yeni dünya qurulur; Sərt sulara dəmir bəndlər vurulur.* Z.Xəlil.

◊ **Bənd almaq** – gedib, ya qaçıb bir yerdə dayanmaq, durmaq, qərar tapmaq. *Nə olardı Ağa Məhəmməd xan bu cəlalı görəydi. Yəqin qorxudan qaçaraq Tehranda bənd alardı.* Ə.Haqverdiyev. *Kişi mayallaq vurub, fırlana-fırlana balkonun ayağında bənd aldı.* S.Rəhimov. **Bənd etmək (eləmək)** – məftun etmək, cəlb etmək, aşiq etmək. *Sərxoş oturanda əlində sazı; Bənd edir quşları göydə avazı.* M.P.Vaqif. **Bənd olma(yın)!** – fikir vermə(yin), əhəmiyyət vermə(yin), işin(iz) olmasın, mane olma(yın). *Nina bacı, mən ölüm mənə bənd olma, belə başına dönərəm.* M.S.Ordubadi. *Xəlil dayı: – Sən Allah, bənd olma, – dedi, – yaxşısı budur Firidundan danış.* M.Hüseyn. **Bənd olmaq** – 1) bir işdən yapışmaq, bir işlə məşğul olmaq, bir işlə başı qarışmaq. [Məşədi Cəfər:] *Məndən sonra bir bölük yetim-yesir qalacaq, onların əlləri gərək bir şeyə bənd olsun, ya yox?* Ə.Haqverdiyev; 2) ilişmək, yapışmaq, bağlanmaq. *Çox keçmədi, onu gördüm ki, bir əl mənim yaxama bənd oldu.* Mir Cəlal; 3) ilişib qalmaq, dayanmaq, durmaq, qərar tutmaq. *Əvvəl mən, sonra qonaqlar məclisin şirin yerində bənd olduq.* C.Məmmədquluzadə; 4) bağlanmaq, rəbt olunmaq, mərbut olmaq. *Məmləkətdə qoyulmuş qanunların hamısı zəncirin halqası kimi bir-birinə bənd olubdur.* M.S.Ordubadi. **Bəndə çəkmək** – əl-qolunu bağlamaq, hərəkət etməsinə mane olmaq. *Sevastopol, düşmənin böyük bir qüvvəsini burada bəndə çəkibdir.* Ə.Əbülhəsən. **Bəndə düşmək** – yubanmaq, gecikmək, təxirə düşmək, ləngimək, ilişib qalmaq. *Çox yağılar bəndə düşdü, qayıtmadı bir də geri.* R.Rza. **Bəndə salmaq** – 1) girə keçirmək, ələ keçirmək; 2) dustaq etmək, həbsə salmaq. *Bəndə saldın mənim kimi dustağı; Çox məni qoyubsan darda, gül Pəri.* Aşıq Abbas. **Bəndə vurmaq** – 1) dustaq etmək, həbsə salmaq; qaçmasın deyə əllərini, ayaqlarını bağlamaq; 2) məəttəl etmək. – *Axı, Nəbi kişi, binanı tikən sizsiniz, camaatı niyə bəndə vurursunuz?* S.Rəhimov. **Bəndinə çəkmək** – əlinə keçirmək, cənginə keçirmək (salmaq). [Xırdaxanım:] *Yoxsa o qızları oxutmuş ləçərlər, əgər bilsələr, oğlanı çəkəcəklər bəndlərinə.* N.Vəzirov.

**bənd-bənd** *zərf* 1) buğum-buğum, tikə-tikə. *Nalədəndir ney kimi avazeyi-eşqim bülənd; Nalə tərkin qılmazam, ney tək kəsilsəm bənd-bənd.* Füzuli. *Öldürər bu dərd məni; Doğrayar bənd-bənd məni.* (Bayatı); 2) maddələr üzrə, maddəbəmaddə. *Nizamnaməni bənd-bənd oxumaq;* 3) bəndlər üzrə. *Bənd-bənd oxumaq. – Bütün gözlər şairin .. əsəbi tərpənən dodaqlarında, həqiqət deyən ağzında idi. O, bənd-bənd deyirdi.* Mir Cəlal.

**BƏND**$^2$ [*fars.*] Vurğun, vurulmuş, aşiq. *Oğlan qıza bənddir.* □ **Bənd olmaq** – aşiq olmaq, vurulmaq, bərk sevmək, məftun olmaq. *Düşübdür xəyalım yarın ruyinə; Can quşu bənd olub zülfü muyinə.* M.V.Vidadi. *Bənd olmuşam şirin-şirin sözünə; Şəkər dodağında balı sevmişəm.* M.P.Vaqif. *Kimin zülfünə bənd oldunsa, Seyyid, bivəfa çıxdı.* S.Ə.Şirvani. *Aşığı bənd eylər zülfünün tağı; Ahu gözlüm, nə gəzirsən məzarı.* Aşıq Kərəm.

**BƏND-BƏRƏ** *is.* 1. Keçid, keçiləcək yer, keçilə biləcək yeganə yer. *Hər tərəfdən düşmənin bənd-bərəsini bağladılar. – ..Qoşun atlandı, yolları, bənd-bərəni kəsdi.* "Koroğlu".

*Kəsib bəndi-bərəni; Düşmən qoşunlarını amansız zərbələrlə; Can evində haqlayır.* R.Rza.

2. Sərhəd, hüdud. [Mərdan:] *İlbəil mənim ürəyimə yazılıb, kin kitabı bağlanmasa idi, inan ki, mən bənd-bərəni belə aşmazdım.* Mir Cəlal.

**BƏNDƏ** *is.* [*fars.*] *köhn.* 1. Qul, kölə. *Halım deyib muradıma yetsən əcəb dəgil; Bir bəndəyəm ki, dərgəhi-sultanə yetmişəm.* Füzuli. [Səkinə xanım:] *Xeyr, Ağa Həsən, sən mənim nə bəndəmsən, nə qulumsan.* M.F.Axundzadə. *Səadətin bulağı insan ürəyindədir; Bunu anlamayanlar bir kölə, bir bəndədir.* R.Rza.

2. Keçmişdə danışan şəxs hörmət və təvazö üçün özünə işarə olaraq, "mən" əvəzində belə deyərdi. *..Naxçıvanda teatr həvəskarları, bəndə də onların içində, teatr oynayırdıq.* C.Məmmədquluzadə. [Dərviş:] *Xanım, bəndəyə görə nə fərmayişiniz var?* N.Vəzirov. [Mirzə:] *Amma ağadan təvəqqem budur: əgər iltifatınız olsa, bəndəyə bir yabı əta eyləyəsiniz.* Ə.Haqverdiyev.

3. Adam, insan, məxluq mənasında. *Oxucularım bağışlasınlar ki, bir neçə sətir zehni qaşıyan sözlər ilə mömin bəndələrin ovqatını xarab etdim.* C.Məmmədquluzadə. *Bizimtək günahkar bəndələrə nə qulanquşqun!* Ə.Haqverdiyev. [İsmayıl:] *Molla olsa da, çox nadürüst bəndədir.* P.Makulu. ☐ **Allah bəndəsi** – fağır adam, heç kəsə zərər verməyən, dinc, sakit adam, mömin adam. [Molla Fərzəli:] *..Xüsusən mənim kimi bir Allah bəndəsi ki, ömrümdə xah qürbətdə, xah öz vilayətimizdə əhli-xanəmdən bir dəfə də olsun kənar düşməmişəm.* C.Məmmədquluzadə. [Xəlifə:] *Bu məktubu alan kimi Allah bəndələrinin mallarını özlərinə qaytarmalısınız.* M.S.Ordubadi.

**BƏNDƏÇİLİK** b a x **bəndəlik**. [Hacı Kərim:] *Vallahı razı olmaram, gərək şeyx cənablarının bəndəçiliyini özüm qəbul edəm.* C.Məmmədquluzadə.

**BƏNDƏLİK** *is. köhn.* 1. Köləlik, qulluq.

2. Qulluqçuluq, nökərlik, xidmətçilik. *Buyur, ta bəndəlik edim baş ilən; Hər nə qulluğundur cana, xoş gəldin!* M.P.Vaqif. [Ağa Həsən:] *Xanım, niyə məni bəndəliyə qəbul etmirsən, məndən nə xəta baş veribdir?* M.F.Axundzadə. *Hökmdar bu gözəlliyə qarşı bəndəlik etməyə hazırdır.* M.S.Ordubadi.

**BƏNDƏM** *is.* 1. Meyvə saplağı.

2. Dərz bağlamaq üçün otdan, küləşdən eşilən bağ. *Bu dərzin bəndəmini aç, xırmana tök. – Ona görə onların taxılı yolpa olmuş, dərzləri bəndəmin arasına güc ilə yığılırdı.* S.Rəhimov. [Arvadlar] *bəndəmi açıb dağıdırdılar.* Ə.Əbülhəsən. // Bir şeyin belinə bağlanan bağ, şərid.

**BƏNDƏMLƏMƏ** "Bəndəmləmək"dən *f.is.*

**BƏNDƏMLƏMƏK** *f.* Bəndəmlə bağlamaq.

**BƏNDƏMLƏNMƏ** "Bəndəmlənmək"dən *f.is.*

**BƏNDƏMLƏNMƏK** *məch.* Bəndəmlə bağlanmaq.

**BƏNDƏMLİ** *sif.* Bəndəmi olan, bəndəmə bağlanmış.

**BƏNDƏMLİK** *sif.* Bəndəmə yarar.

**BƏNDƏR** *is.* [*fars.*] 1. Keçid, yol. *Qara Məlik hər tərəfdən məhəlləyə girən bəndərləri kəsdirdi.* M.S.Ordubadi.

2. Ticarət limanı.

**BƏNDƏRGAH** *is.* [*fars.*] 1. Düşmənin, yaxud ovlanan heyvanın keçə biləcəyi yeganə yer, yol, keçid və s. *Tutulub bəndərgah, kəsilib bərə; Tapmırıq çıxmağa yol, aman, aman!* "Koroğlu". *Öz ehtiyatını görüb bəndərgahlarda əsgər qoyan komandir xəritəni çəmənin üstünə sərib, karandaşla cızıq çəkirdi.* S.Rəhimov.

2. B a x **bəndər.**

**BƏNDƏZADƏ** *is.* [*fars.*] *köhn.* Keçmişdə bir şəxs müsahibinə hörmət üçün, oğluna işarə olaraq "mənim oğlum" əvəzində belə deyərdi. [Xudaverdi:] *Bu gün səhərdən bizim evin qabağından keçəndə bəndəzadənizə özünüz buyurmayıbsınız ki, atana de, bu gün bir cümə surəsi mənim atama oxusun?..* M.F.Axundzadə.

**BƏNDFƏRMAN** [*fars.*] *köhn.* Əmrə, buyuruğa, fərmana hazır olan. *Əsəd der: hökmündə bəndfərmanəm; Sənsən mənə sultan, Pəri, can Pəri!* Aşıq Əsəd.

**BƏNDİVAN** *dan.* Məəttəl, bənd. [Merac:] *Gözəl, mən sənin bəndivanınam, geyin gedək.* Ə.Vəliyev. ☐ **Bəndivan olmaq** – 1) bənd olmaq, məəttəl olmaq; 2) *məc.* qonmaq. *Can*

*quşu xallarda bəndivan olur; Diriliyin zövqü ləb-dəhəndədir.* M.P.Vaqif.

**BƏNDLƏMƏ** "Bəndləmək"dən *f.is.*

**BƏNDLƏMƏK** *f.* 1. Başdansovma tikmək, kök atmaq, kökləmək. *Vaxt çatmamışdı ki,* [nənəm donumun] *düymələrini qoysun, odur ki, donu əynimə geydirib, yaxasını sapla bəndlədi.* H.Sarabski.

2. Ala-babat, yarımçıq, yüngülcə bağlamaq; bənd etmək, ilişdirmək.

3. *dan.* Başdan rədd etmək, birini aldadıb, bir şeyi ona ötürmək, sırımaq.

4. *dan.* Dəyərli bir şeyi hiylə ilə ucuz qiymətə almaq, qoparmaq, əlinə keçirmək. [Məşədi:] *Çünki verdiyim pulu da müamiləsi ilə alırdım, düşəndə bir at da bəndləyirdim.* Ə.Haqverdiyev.

**BƏNDLƏNMƏ** "Bəndlənmək"dən *f.is.*

**BƏNDLƏNMƏK** *məch.* 1. Başdansovma tikilmək, köklənmək.

2. Bənd olub qalmaq, ilişib qalmaq.

**BƏNDLİ** *sif.* Bağlı. *Boynu bəndli camışlar tövlədə fısıldaşır və gövşək çalırdılar.* S.Rəhimov.

**BƏNƏK** *sif. köhn.* 1. Üzdə, ya bədənin başqa yerində nöqtə şəklində kiçik xal, nişan.

2. İt adı.

**BƏNƏKLİ** *sif.* Xallı. *Xəstə Qasım bir qız sevib hənəkli; Ağ üzündə xallar, bənək-bənəkli.* Xəstə Qasım.

**BƏNƏVŞƏ** *is.* [*fars.*] b a x **bənövşə.** *Başına döndüyüm gülüzlü Pəri; Adətdir dərərlər yaz bənəvşəni.* Qurbani. *Apardı əqlimi bir ahu gözlü; Bir bənəvşə boylu, bir lalə üzlü.* M.V.Vidadi. *Yaşıl köynəyini geyinir meşə; Yaxama quş kimi qonur bənəvşə.* S.Vurğun.

**BƏNƏVŞƏLİK** b a x **bənövşəlik.** *Bənəvşəlikdə, yasəmənlikdəyəm; Könül açar yavaş əsən küləklər.* A.Səhhət.

**BƏNƏVŞƏYİ** [*fars.*] b a x **bənövşəyi.**

**BƏNG** *is.* [*fars.*] 1. Toxumunda narkotik maddələr olan bitki; bəng otu.

2. Həmin bitkinin toxumundan hazırlanan keflǝndirici maddə; həşiş. [Yusif Sərrac:] *Aya dəli olubsunuz, ya bəng atıbsınız ki, bu qəbil sözləri mənim üzümə deyirsiniz!* M.F.Axundzadə. *İçdim südü, çəkdim bəngi; Əcayib şiri-məst oldum.* Nəbati. *Zahid ki, deməz ad bizə napakdən özgə; Bizdən nə görüb bəng ilə tiryakdən özgə.* S.Ə.Şirvani.

**BƏNGİ** *is.* [*fars.*] *köhn.* Bəng düşkünü, bəng çəkən, həşiş çəkən adam. *Nə şərabiyəm, nə bəngi, nə xəyaliyəm, nə rəngi.* Nəbati. *Bəngilərin, bu bir sürü ərbabi-qəflətin; Halisəfalətilə gözüm giryəbar idi.* M.Hadi.

**BƏNİ** [*ər.*] Övlad, oğullar. ☐ **Bəni-adəm** – insan, adam. *Mən bəni-adəm üçün görməmişəm səcdə ola.* S.Ə.Şirvani. **Bəni-insan** – b a x **bəni-adəm.** *Bir tərəf qurd edibdi bağrımı qan; Bir tərəfdən də xud bəni-insan.* S.Ə.Şirvani. **Bəni-növi-bəşər** – b a x **bəni-adəm.** *Lakin çifayda bəni-növi-bəşər heç vəqtdə yaxşı günə dözməz.* M.F.Axundzadə. // Bəzi qəbilə və xanədan adlarında işlənilir; məs.: bəni-İsrail (İsrail oğulları), bəni-Haşim (Haşimilər).

**BƏNİZ** *is.* Üz, çöhrə, sifət. [Toğrulun] *qara və böyükcə gözləri ildırımlar çaxır, geniş və qırmızı bənizindən qəzəb alovları qarsırdı.* H.Nəzərli. // Üzün rəngi. *Bənizi solmaq. Bənizi qaçmaq. Bənizi ağ. – Zəfərantək bənizimi döndərdi ol birəhm yar; Düşməni xəndan edib, dostini giryan eylədi.* Nəsimi. *Bu sözləri dodağının altında deyə-deyə, ata .. uşağın azarlı və bənizi qaçmış üzünə baxırdı.* M.F.Axundzadə. *İdrisin bənizi solğun idi.* Ə.Məmmədxanlı.

**BƏNLİK** *is.* b a x **mənlik.**

**BƏNNA** *is.* [*ər.*] Binanın daş, kərpic hissəsini tikən usta. *Dodaqaltı segah deyən qoca bənnalar; Sal daşlardan təməl qoyur, divar hörürdü.* Ə.Cəmil. *İnşaatçıların çoxu mövsüm işçilərindən: torpaqqazanlar, bənnalar və dülgərlərdən ibarət idi.* Ə.Sadıq.

**BƏNNALIQ** *is.* Bənnanın işi, sənəti, peşəsi. [Mahmud:] *Mən əvvəllər elə bilirdim ki, bənnalıq .. adi bir fəhləlikdir.* Z.Xəlil.

**BƏNNƏ** *dan.* b a x **bənna**. *Əkbərin gözü bənnə şagirdliyində açıldı.* Mir Cəlal.

**BƏNÖVŞƏ** *is.* Yazda bitən, əksərən açıq-qırmızıya çalar abı rəngli, gözəl qoxulu kiçik çiçək. *Bənövşə birillik bitkidir. Gözəl saplaqları üzərində yerləşmiş müxtəlif şəkilli yarpaqları vardır...* Əliyev. *Zorba və hündür ağacların kölgəsində yenicə baş qaldırmış bənövşələr .. boynunu əyərək mat-mat baxırdı.* Ə.Vəliyev.

**BƏNÖVŞƏLİK** *is.* Bənövşə bitən yer, bənövşə əkilmiş yer.

**BƏNÖVŞƏYİ** *sif.* Bənövşə rəngli. *Bənövşəyi parça. Bənövşəyi sap. – Onların* [qızların] *ağ, qırmızı və bənövşəyi kəlağayıları tovuz qanadı kimi havada çırpınır.* İ.Əfəndiyev.

**BƏNÖVÜŞ** *is.* bax **bənövşəyi**. *Gah bənövüş, gah qırmızı, gah da laləzar oluram.* Aşıq Hüseyn. [Kəklik xalanın] .. *başında ağ haşiyəli bənövüş kəlağayı var idi.* İ.Əfəndiyev.

**BƏNZƏDİLMƏ** "Bənzədilmək"dən *f.is.*

**BƏNZƏDİLMƏK** *məch.* 1. Oxşadılmaq, uyğunlaşdırılmaq.

2. Təqlid edilmək.

3. Səhvən başqasına oxşadılmaq.

**BƏNZƏMƏ** "Bənzəmək"dən *f.is.*

**BƏNZƏMƏK** *f.* 1. Oxşamaq. *Yanaq üzrə saçın tovuza bənzər.* Nəsimi. *Daşə bənzər bağrı, təsir eyləməz əfqan ona.* Füzuli. *Fələk rənginə bənzər bu bənövşə.* X.Natəvan. *İllərin yarpaq kimi bir-birinə bənzəyən müxtəlif günləri var.* R.Rza.

2. Tay olmaq, tənləşmək, bərabər olmaq, uyğunlaşmaq. *Sən heç bir vaxt ona bənzəməzsən.*

**BƏNZƏR** 1. *sif.* Oxşar, oxşayan, bənzəyən, tay, uyğun. *Bir-birinə bənzər. Əkizlər çox zaman bir-birinə bənzər olurlar. – Əlfazi Nəsimi bu gün ol möcüzədir kim; Bənzər ona bir lölöi-şəhvar ələ girməz.* Nəsimi. *Nə qədər qız yetirsə Gürcüstan; Sana bənzər mələk yetirməz, inan.* H.Cavid.

2. *is.* Misl, tay, bərabər, timsal. *Nə biləsən nə arayır xəyalında bu qoca; Bənzəri var bu torpaqda kök salan bir ağaca.* S.Rüstəm. *Sənət dəryaya bənzər, onun min bir halı var...* B.Vahabzadə.

**BƏNZƏRLİK** *is.* Oxşarlıq, uyğunluq. *Bu iki şeyin arasında heç bənzərlik yoxdur.*

**BƏNZƏTMƏ** 1. "Bənzətmək"dən *f.is.* *Bir-birinə bənzətmə.*

2. *is. ədəb.* Nəzirə surəti ilə bir əsərə təqliddən yazılmış əsər. *Nizamiyə bənzətmə. Füzuliyə bənzətmə. Sabirə bənzətmə.* // Təşbeh.

**BƏNZƏTMƏK** *f.* 1. Oxşatmaq. *Bənzətməz anın yüzini ayə Nəsimi, sor nədən.* Nəsimi. *Əhli-təmkinəm, məni bənzətmə, ey gül, bülbülə.* Füzuli.

2. Yanılıb bir şeyi başqa bir şey zənn etmək, yanılıb oxşatmaq. *Sizi müəlliminizə bənzətdim.*

**BƏNZƏYİŞ** *is.* Bənzəmə, oxşama; bənzərlik, oxşarlıq. *İki şeyin bir-birinə bənzəyişi.*

**BƏRABƏR** 1. *sif.* Başqası ilə tən, bir ölçüdə, bir boyda olan. *Bərabər qiymətli. Bərabər qüvvəli. Bərabər kəmiyyətli.* □ **Boyu bərabəri** – özü boyda. [Mehri xanım:] *Bala, axır mən anayam! Boyum bərabəri oğul yetirmişəm.* Ə.Haqverdiyev. **Bərabər etmək** – 1) bax **bərabərləşdirmək;** 2) bax **bərabər tutmaq** (aşağıda, 4-cü mənada).

2. *sif.* Başqası ilə bir hüquqda, bir vəziyyətdə olan. *Bərabər hüquq. Deputat seçkiləri bərabərdir; hər bir vətəndaş bir səsə malikdir; bütün vətəndaşlar seçkilərdə bərabər əsaslar üzrə iştirak edirlər.* – [Cahan:] *İndi bizim hüququmuz kişilərlə bərabərdir.* Ə.Haqverdiyev.

3. *Zərf mənasında*. Bir yerdə, birlikdə, birgə, yanaşı, bahəm. *Bərabər işləmək* (*çalışmaq*). *Bərabər oxumaq. – Nəbiqulu yeşiklə bərabər ağacdan uçub düşüb Qasımın otağının üstünə.* Ə.Haqverdiyev. *Bu qaranlıqla bərabər mavi boşluqlardan yerə xoş bir sərinlik də enirdi.* M.İbrahimov. *Burada meyvə ilə bərabər .. nisbətən ucuz qiymətə şərab da tapmaq olurdu.* Ə.Əbülhəsən.

4. *İs. mənasında*. Tay, bənzər, misl. *Onun bərabəri yoxdur. – Qaşı ay, çeşmi şux, müjganları ox; Cümlə kəsdən artıq, bərabəri yox.* M.P.Vaqif. *Hikmətdə sənə heç kəs bərabər ola bilməz.* M.F.Axundzadə. □ **Bərabər tutmaq** – bir tutmaq, tay tutmaq, başqası ilə bir tutmaq, bərabərləşdirmək.

5. *İs. mənasında.* Ön, qarşı, tuş, qabaq. [Şeyx Nəsrulla:] *Bəlkə sizin də içinizdə belə münkirlər var? Əgər var, gəlsin bərabərimə.* C.Məmmədquluzadə. *Görcək anasın bərabərində; Yaş oynadı qəmli gözlərində.* A.Səhhət.

6. *Xəbər mənasında*. Birdir, eyni şeydir deməkdir. *Neftçinin borandan qorxub geri çəkilməyi, əsgərin silahı atıb səngərdən qaçmasına bərabərdir.* M.Hüseyn.

**BƏRABƏRCƏ** *zərf* 1. Bir bərabərdə, bir boyda, bir böyüklükdə, bir miqdarda, bir həcmdə, bir ölçüdə; tən yarı.

2. Bir yerdə, bərabər, yan-yana.

**BƏRABƏRÇİLİK** *is.* Heç bir əsas olmadan əmək haqqını və s.-ni bərabərləşdirmək cəhdi.

**BƏRABƏRLƏMƏK** bax **bərabərləşdirmək.**

**BƏRABƏRLƏŞDİRİLMƏ** "Bərabərləşdirilmək"dən *f.is.*

**BƏRABƏRLƏŞDİRİLMƏK** *məch.* Bərabər hala salınmaq, bir ölçüyə, bir əndazəyə salınmaq, tənləşdirilmək, tarazlaşdırılmaq. *Hüquqca bərabərləşdirilmək. Ölçüləri bərabərləşdirilmək. Səviyyəcə bərabərləşdirilmək.*

**BƏRABƏRLƏŞDİRMƏ** "Bərabərləşdirmək"dən *f.is.*

**BƏRABƏRLƏŞDİRMƏK** *f.* Bərabər hala salmaq, bərabər etmək, bir ölçüyə, bir əndazəyə salmaq, tənləşdirmək, tarazlaşdırmaq.

**BƏRABƏRLƏŞMƏ** "Bərabərləşmək"-dən *f.is.*

**BƏRABƏRLƏŞMƏK** *f.* Bərabər olmaq, tənləşmək, tarazlaşmaq; bir ölçüyə, bir əndazəyə gəlmək. // Ayaqlaşmaq. *Sən onunla bərabərləşə bilməzsən.*

**BƏRABƏRLİK** *is.* 1. Cəmiyyətdə insanların bütün cəmiyyətin istehsal vasitələrinə bir cür münasibətdə və bərabər siyasi və vətəndaşlıq hüququna malik olmalarını təmin edən vəziyyəti. *Kapitalizm quruluşunda heç bir həqiqi bərabərlik ola bilməz.*

2. Tənlik, tarazlıq, müvazinət.

**BƏRABƏRSİZLİK** *is.* 1. Cəmiyyət üzvlərinin hüquq və ictimai-siyasi cəhətdən bir hüquqda olmadığı vəziyyət. *Ölkəmizdə kişilərlə qadınlar arasındakı hüquq bərabərsizliyi tamamilə aradan qaldırılmışdır.*

2. Müvazinətsizlik, uyğunsuzluq.

**BƏRABƏRTƏRƏFLİ** *sif. riyaz.* Tərəfləri bərabər olan. *Bərabərtərəfli üçbucaq.*

**BƏRABƏRÜZLÜ** *sif. hənd.* Üzləri bərabər olan. *Bərabərüzlü üçbucaq.*

**BƏRABƏRYANLI** *sif. riyaz.* İki yanı bərabər olan. *Bərabəryanlı üçbucaq.*

**BƏRADƏR** *is.* [*fars.*] Qardaş. *Bəradərim Cəmil ilə məsləhəti bu yerə qoyduq ki, qabaqca o getsin.* C.Məmmədquluzadə. // Dostcasına müraciət. [Nəcəf bəy:] *Bəradərim Nəcəf! Kağız yazıb, Cavadnan göndərmişdin, gəldi vüsul oldu, oxuyub məzmunundan xəbərdar oldum.* Ə.Haqverdiyev.

**BƏRADƏRANƏ** *sif.* və *zərf* [*fars.*] Qardaşcasına, qardaş kimi. *Bəradəranə münasibət.*

**BƏRAƏT** *is.* [*ər.*] *hüq.* Təmizə çıxma; günahsız, təqsirsiz olduğu meydana çıxma; müqəssirin günahsız olduğunu, cəzaya layiq olmadığını etiraf edən məhkəmə qərarı. *Məhkəmə bəraət hökmünü çıxardı.* ☐ **Bəraət qazanmaq** – günahsız, təqsirsiz olduğu meydana çıxmaq; təmizə çıxmaq. *Məhkəmədə bəraət qazanmaq.* **Bəraət qazandırmaq** – təmizə çıxarmaq, haqq qazandırmaq, haqlı olduğunu etiraf etmək. [Firidun:] *Sizin qəhrəman saydığınız bütün müqəssirlərə bəraət qazandırıram.* M.İbrahimov. *Qulam o adama bəraət qazandırmaq üçün tələsik qeyd etdi...* Ə.Əbülhəsən.

**BƏRAƏTLƏNDİRMƏ** "Bəraətləndirmək"dən *f.is.*

**BƏRAƏTLƏNDİRMƏK** *f. hüq.* Bəraət qazandırmaq, bəraət vermək, təmizə çıxarmaq.

**BƏRAT** [*ər.*] bax **barat.**

**BƏRATƏLQÖVL, BƏRATÜLQÖVL** *köhn.* bax **protokol.** [Senzor:] *Hökumətə çatan bəzi şayiatı təftiş və təhqiq edib, bu barədə bəratəlqövl yazaq.* C.Məmmədquluzadə. [Pristav:] *Mənə də əmr olunubdur ki, sizi* [Məşədi Əkbəri] *danışdırıb, bəratəlqövl yazıb, silistçiyə göndərim.* Ə.Haqverdiyev. [Əbülhəsən bəy:] *Mən rica edirəm ki, bütün dediklərimi bəratəlqövldə qeyd edəsiniz.* M.S.Ordubadi.

**BƏRAY(İ)..,** *qoş.* [*fars.*] *köhn.* Ötrü, üçün. *Bərayi-ehtiyat* (ehtiyat üçün). – [Ocaqqulu:] *Təbrizdənəm, – dedi. – Buraya bərayi-ziyarət gəldim, yenə vətənə qayıdacağam, əhli-əyalım oradadır.* Çəmənzəminli.

**BƏRBAD** *is.* [*fars.*] Dağılmış, dağınıq, pozğun, pərişan, uçmuş, pozulmuş; çox pis, çox xarab, çox yaman. ☐ **Bərbad etmək (qoymaq)** – dağıtmaq, pozmaq, viran etmək, xarab etmək; heçə çıxarmaq, puç etmək, alt-üst etmək. **Bərbad olmaq** – dağılmaq, viran olmaq, pozulmaq, xarab olmaq; heçə çıxmaq, puç olmaq, alt-üst olmaq. *Bütün əməyim bərbad oldu.* **Evi bərbad olmuş** – qarğış yerində işlənir. *Sən girməyən evlər qoy olsun bərbad; Öldürsün əmiri qaşların, gəlin.* (Qoşma). [Mirzə Qoşunəli:] *Evi bərbad olmuş məni işimdən-gücümdən avara, sərgərdan eləyib.* Ə.Haqverdiyev.

**BƏRBADLIQ** *is.* 1. Pərişanlıq, xarabalıq, viranlıq.

2. Pozğunluq, qatma-qarışıqlıq, intizamsızlıq.

**BƏRBƏR** b a x **dəllək** 1-ci mənada. *Bərbər dükanı.*

**BƏRBƏRXANA** b a x **dəlləkxana.**

**BƏRBƏRİYYƏT** *is.* [*xüs. is.*-dən] Barbarlıq, vəhşilik. *Bir əlac eylə ki, bu bərbəriyyət zəmanəsinin əlifbasında erab hüruf ilə müttəsil yazılsın.* M.F.Axundzadə.

**BƏRBƏRLƏR** *cəm.* 1. tar. Vaxtı ilə Afrikanın şimalında yaşamış, indi isə ərəblərlə qarışmış bir xalq.

2. *məc.* Vəhşi (b a x **barbar**).

**BƏRBƏRLİK** b a x **dəlləklik** 1-ci mənada.

**BƏRBƏT** *is.* [*ər.*] Uda oxşar qədim çalğı aləti. *Əldə incə bərbət, rübab, cənglə dəf; Çalıb-oynayanlar oturdu səf-səf.* Nizamidən.

**BƏRBƏZƏK** *is.* b a x **bəzək** 1-ci mənada. [Əntiqə] *kənddə də varlı qadınlar görmüşdü. Amma bu bərbəzəkdə görməmişdi.* Mir Cəlal.

**BƏRDAŞT** *is.* [*fars.*] *mus.* Azərbaycan muğamlarının giriş hissəsini təşkil edən müqəddimə formalarından birinin adı. *Rast bərdaştla başlayır. – Muğamın bütün pərdələri bərdaştda ifadə olunur. Bu hissəyə müqəddimə də deyilir.* (Qəzetlərdən).

**BƏRDƏK** *is. məh.* Bir yerə toplanmış dərzlər (adətən on dərz) qalağı. *Yasavul .. sarı papağını kənardakı qara qundaqlı berdankasının başına keçirmiş, kürən atın böyründəki alçaq dərz bərdəyinə söykənmişdi.* S.Rəhimov.

**BƏRDƏVAM** *sif.* və *zərf* [*fars.* bər və *ər.* dəvam] *köhn.* Davamlı, davam etməkdə olan, sürəkli, uzunsürən. *Bəlkə yenə bu hal ilə şad kam; Yüz illərcə qalacağam bərdəvam.* A.Səhhət.

**BƏRƏ¹** *is.* 1. Ov gözlənilən yer, pusqu, marıq. *Ovu bərədə vurmalı.* (Ata. sözü). *Aslantək bərəyə yataq; Düşmənlərə şeşpər ataq.* "Koroğlu". *Kəmənd əldə, səyyad ov bərəsində; Ovçu da ağlayar, maral da ağlar.* Aşıq Növrəs İman. *Kişlək ovu tam bərəyə, birbaş ovçunun üzərinə gətirir.* S.Rəhimov.

2. Çıxacaq yer, yol, aralıq. *Tutulub bəndərgah, kəsilib bərə; Tapmırıq çıxmağa yol, aman, aman!* "Koroğlu".

**BƏRƏ²** *is.* 1. Böyük çayların üstündə qurulan mütəhərrik körpü, yaxud üzərində şey daşımaq üçün yan-yana rəbt edilmiş şalbanlardan ibarət üzücü körpü; sal. *Orada bir bərəyə rast gələcəksiniz. Traktorları bərəyə qoyub, o taya keçirdərsiniz.* M.Hüseyn.

2. Bənd (çayda, arxda). *Qədim dayı .. bərədə hərlənir, ancaq mirab Zülqədərin və cuvarların gözündən bir tük belə yayındıra bilmirdi.* S.Rəhimov.

3. Sahildə gəmi dayanan yer; dənizin, çayın sahilə dayaz yeri.

4. Bağ və bostanların arasında qoyulan cığır, ara, sərhəd, açıq yer, mərz. *Bostanın bərəsini tikanla tutmaq.*

**BƏRƏÇİ** *is.* Bərəni idarə edən şəxs, salçı.

**BƏRƏÇİLİK** *is.* Bərəçinin işi, sənəti.

**BƏRƏKALLAH** [*ər.* "bərakəllah"] Əhsən, mərhəba və s. mənasında tərif, bəyənmə ifadə edir. *Bərəkallah, oğlum! – Bərəkallah, qüvvətlicə alabaş; Filin üstə əcəb gedir bir baş.* A.Səhhət. // Bəzən kinayə və ya istehza ilə deyilir. [Sona xanım:] *Bərəkallah, mən də deyirəm bəs oğlan doğrudan pul tapıbdır*. M.F.Axundzadə.

**BƏRƏKƏT** *is.* [*ər.*] 1. Bolluq, məhsuldarlıq. [Əmioğlu:] *Yoxsa həqiqətdə bizim südümüzün bərəkəti həmin qapıbir qonşularımızın pambığının bərəkətinə bağlıdır.* C.Məmmədquluzadə. [Nizami:] *Məmləkətimizin mövqecə əhəmiyyəti, düzlərimizin zənginlik və bərəkəti daima düşmənlərimizin iştahasını coşdurmuşdur.* M.S.Ordubadi. ☐ **Bərəkət tapmaq, bərəkət artmaq** – bollaşmaq, çoxalmaq; qiymətə minmək. *Veylabadda hər bir şey danışılırdı, .. çoxlu ocaqlar* (*pirlər*) *zühur etmişdi, .. birdən-birə mollaların pulları bərəkət tapmışdı.* Çəmənzəminli. **Bərəkəti qaçmaq** – azalmaq, tükənmək, qiymətdən düşmək.

2. Səmərə, fayda, xeyir, artım. *Bərəkət ondur, onu da düzlük.* (Ata. sözü).

3. Çıx. halında: **bərəkətindən** – üzündən, nəticəsində, sayəsində. [Şeyx Nəsrulla:] *Həmin bu mərəzin bərəkətindəndir ki, mən bu bambılı Əhmədin yanında olmuşam bir balaca uşaq.* C.Məmmədquluzadə.

4. Nida mənasında. ..*Qış fəsli nə qədər gözəl olsa da, yenə bahar fəslinə bərəkət!* C.Məmmədquluzadə.

**BƏRƏKƏTLİ** *sif.* 1. Bol, bollu, zəngin. *Bayram günlərində düzələn böyük ziyafətlərin bərəkətli süfrəsini bu gülşəndə yetişən*

*qərənfillər yaraşığa mindirirdi.* M.Hüseyn. // Məhsuldar, bəhrəli, bol məhsullu; münbit. *Bərəkətli torpaq.* – [Salama] *elə gəlirdi ki, bu yağış da onunla .. buraya, bu geniş düzlərin bərəkətli tarlalarına gəlmişdi.* Mir Cəlal. *Bu il rayonun, doğrudan da, bərəkətli illərindən biri idi.* S.Rəhimov.

2. *dan.* Qurtarmaq bilməyən, tükənməyən, qurtarmayan, artımlı. *Bu dəfə aldığımız düyü çox bərəkətli çıxdı.*

3. *məc.* Şükümlü, uğurlu; rifahlı, məsud.

**BƏRƏKƏTSİZ** *sif.* Bərəkəti olmayan, tez qurtaran, davamsız, artımsız. // Kafi miqdarda olduğu halda, xeyri görülməyən. *Sanki havadan un ələnirdi. Ancaq bu bərəkətsiz un yeri ağartmırdı.* Mir Cəlal.

**BƏRƏKƏTSİZLİK** *is.* 1. Bərəkəti, artımı olmama; miqdarı kafi olduğu halda, xeyri görünməmə; azlıq, kifayətsizlik, artımsızlıq, çox tez qurtarma.

2. *məc.* Uğursuzluq, şükümsüzlük, rifahsızlıq.

**BƏRƏKS** *zərf* [*fars.* bər və *ər.* əks] Əksinə olaraq, əksinə, tərsinə, ziddinə, zidd. *Bərəks danışmaq.* – [Balaqardaş:] *Hər kim mənə bərəks getdi, vay onun halına!..* N.Vəzirov. [Mehri xanım:] *..Sən niyə onun sözünə bərəks gedirsən.* Ə.Haqverdiyev. *Hacı Səməd, başqa müsəlman atalara bərəks olaraq, uşaqlarının dərslərinə, ədəb və tərbiyəsinə çox fikir verirdi.* S.S.Axundov.

**BƏRƏLƏMƏ** "Bərələmək"dən *f.is.*

**BƏRƏLƏMƏK** *f.* 1. Bostan və ya bağı sulamaq üçün bərə çəkmək, arx açmaq, suyu ləklərə calamaq.

2. *məc*. Yaralamaq, döyməklə göyərtmək, qançır etmək.

**BƏRƏLMƏK: gözləri (gözü) bərəlmək** – qorxudan, hiddətdən, acıqdan, heyrətdən, çaşqınlıqdan gözləri geniş açılmaq, genəlmək, böyümək. *Valya yavaş-yavaş yerindən tərpəndi, gözləri bərəlmiş halda dərindən nəfəs aldı.* S.Rəhimov. *Rəhim bəyin gözləri bərəldi: – Adə, mənim peşkəşimi geri qaytarırsan?* [dedi] M.Hüseyn. ◻ **Gözləri bərələ qalmaq** – güclü işıqdan, yaxud təəccübdən gözləri geniş açılmaq. *İşıqdan qamaşan gözlər bərələ qaldı.* Mir Cəlal. [Şahın] *piy basmış gözləri bir an içərisində ölü qoyun gözü kimi bərələ qaldı.* P.Makulu.

**BƏRƏLƏNMƏ** "Bərələnmək"dən *f.is.*

**BƏRƏLƏNMƏK** *f.* 1. *məch.* Bərə çəkilmək, arx açılmaq, suyu ləklərə calanmaq.

2. *məc*. Yaralanmaq, yara açılmaq. *Yenə mindi qəm səməndin yollandı; Heç bilmədim bərələnmiş könlümü.* M.V.Vidadi.

**BƏRƏLTMƏ** "Bərəltmək"dən *f.is.*

**BƏRƏLTMƏK: gözlərini (gözünü) bərəltmək** – 1) qorxudan, acıqdan, şiddətdən, təəccübdən, heyrətdən, çaşqınlıqdan gözlərini geniş açmaq, ağartmaq. *Bənə hər qəzetçi bərəldir gözün; Yazır hey qəzetlərdə məktəb sözün.* M.Ə.Sabir. *Mustafa çığırır, həkim istəyir uşağa yavuqlaşa, uşaq gözlərini bərəldir və mıqqıldayıb istəyir qaça.* C.Məmmədquluzadə. *..Nağıyev su qırağındakı otların arasına girən qurbağa kimi kiçik gözlərini həddindən artıq bərəldərək baxırdı.* M.S.Ordubadi. *Məryəm heyrətdən gözünü bərəldib, cavab üçün söz axtarırdı ki, Nadir ikinci bir sual verdi..* B.Talıblı; 2) *məc.* qorxutmaq, hədələmək; hiddətlənmək. *Niyə bəs böylə bərəldirsən, o qare gözünü?! Yoxsa bu ayinədə əyri görürsən özünü?* M.Ə.Sabir.

**BƏRƏYƏÇİ** *is. məh.* Silahı hazır vəziyyətdə tutaraq, bərədə durub ovu gözləyən ovçu. *Ümdə girəvələrdə və keçilməz bəndərgahlarda dayanmış bərəyəçilər öz nəfəslərini udmağa çalışır, az qala söykəndikləri gövdəli palıd ağaclarına bitişirdilər.* S.Rəhimov.

**BƏRFƏRZ** *ara s.* [*fars.* bər və *ər.* fərz] *köhn.* Tutaq ki, ehtimala görə, fərz edək ki. [Hacı Kərim Zərgər:] *Cənab şair, bərfərz ki, bizim hər birimizdə bir təqsir var ki, sənətindən bəhrəyab olmur.* M.F.Axundzadə. *Dedi: "Bərfərz, olsa hər yerdə; Toxuyursan böyük, kiçik pərdə".* M.Ə.Sabir.

**BƏRG** *is.* [*fars.*] *klas.* Yarpaq. *Gül bərginə bənzər sərasər bədən.* M.P.Vaqif. *Saçın tutanda üzarın belə xəyal edirəm; Çəməndə bərgi-gül üstə qara duman yeri var.* Ə.Vahid.

**BƏRGƏŞT** *is.* [*fars.*] *klas.* Qayıtma, dönmə. ◻ **Bərgəşt etmək** – qayıtmaq, dönmək. *Tazədən bərgəşt edib, bir də cavan olsaydım, ah!* M.Ə.Sabir.

**BƏRHƏM** [*fars.*]: **bərhəm etmək** *köhn.* – pozmaq, dağıtmaq, bərbad etmək. *Visaliyardan etdin büsatım bərhəm, ey gərdun!* S.Ə.Şirvani; **bərhəm olmaq** *köhn.* – pozul-

maq, dağılmaq, qarışmaq, bərbad olmaq. *Bərhəm olur dərdlər, qəmlər, həmdəmlər; Birbirinə gündə dəyər, ağlaram.* M.V.Vidadi. *Bitmiş ramazan, bərhəm olur məclisi-ehsan; Nəqdin verərək, nisyə behişt aldı müsəlman.* M.S.Ordubadi.

**BƏRHƏVA** [*fars.* bər və *ər.* həva]: **bərhəva etmək** *köhn.* – puç etmək, tələf etmək, məhv etmək, havaya sovurmaq. *Kiçiyinə dedim: – A tərlan bala; Düşmən sürüsünü eylə bərhəva.* R.Rza.

**BƏRHƏYAT** *sif.* [*fars.* bər və *ər.* həyat] Diri, yaşayan. ☐ **Bərhəyat olmaq** – sağ olmaq, yaşamaq. *Cahanda bərhəyat olduqca bitməz təbi-fəyyazım.* M.Hadi.

**BƏRİ** 1. *zərf* Bu tərəfə, buraya, bu yana, yaxına. *Bəri gəl. Bəri dur. – Dolanım başına, ey nazlı yarım, bəri bax!* S.Ə.Şirvani. [İmamqulu] *bir də süzüb, bəri gəldi.* Çəmənzəminli. *..Komendant əli ilə cib dəftərçəsini göstərdi: – Onu da bəri ver!* [dedi] M.Hüseyn. // Sif. mənasında. *Qızıl əsgərlər körpünün bəri üzünə qaçmışdılar.* Mir Cəlal.

2. *qoş.* Bir şeyin (hadisənin və s.-nin) başlanma nöqtəsini və o andan başlayaraq davam etdiyini bildirir; ...etibarən. *Üç gündən bəri. Üç ildən bəri görüşməmişik. – Musiqişünasların dediyinə görə, xəstəlikdən qalxandan bəri Həsən, öz sənətində irəliləyərək, daha da böyük məharət göstərməyə başlamışdı.* B.Talıblı. *Mənim də xəyalım dağları aşır; Qəlbimi şerimə verəndən bəri.* O.Sarıvəlli.

**BƏRK** *sif.* 1. Mayelərdən və qazaoxşar cisimlərdən fərqli olaraq, öz şəkil və ölçüsünü mühafizə edən. *Bərk cisimlər.*

2. Sərt, qatı (*yumşaq* ziddi). *Bərk sümük. Bərk daş. Bərk qənd. Bərk ağac. Su donduqda maye halından bərk halına, qaynadıqda isə buxara çevrilir.* // Məc. mənada. *Tükəzbanın bərk üzünü görcək təvəqqe edənlər anladılar ki, bunların yalvarmalarından bir fayda çıxmayacaq.* B.Talıblı.

3. Bədəncə möhkəm, sağlam, davamlı, güclü, dözümlü. *Bərk orqanizm. Canı bərk adam.* – [Ocaqverdi:] *..Bizim canımız bərkdir.* Ə.Haqverdiyev.

4. Sürətli, tez, iti, cəld, yeyin. *Maşın çox bərk gedir. – Buraya qədər iri, yeyin və bərk addımlarla yeriyərək, ətrafındakı hər şeyə etinasız olan ucaboy, zirək əsgər, atəşi azalmış maşın kimi yavaşıdı.* Mir Cəlal.

5. Səbatlı, möhkəm, dönməz, ciddi, dayanıqlı, etibarlı, sarsılmaz. *Sözündə bərk* (z.) *durmaq. O, bərk iradə sahibidir.* ☐ **Bərk durmaq** – səbəb göstərmək, inad göstərmək; dönməmək.

6. Çox güclü, çox böyük, çox şiddətli. *Bərk şaxta. Bərk külək. Bərk zərbə. Bərk qar yağır. – Əgər bircə dəqiqə bərk külək əssə və ya bir təsadüf dolayısı ilə ayağı sürüşsə, fəhlə dənizə düşəcəkdir.* M.Hüseyn. // *Zərf mənasında.* Çox, olduqca, hədsiz, həddindən artıq. *Bərk acmışam.* – [Xəlilin] .. *qaşları daha da bərk çatıldı.* M.Hüseyn. // Ümumiyyətlə, bir şeyin şiddətini, dərəcəsini bildirir. *Bərk tapşırmaq. Bərk ağlamaq. Bərk qışqırmaq. Bərk xəstələnmək. Bərk öskürmək. Bərk yaralanmaq. Bərk qanamaq. Bərk atmaq. Bərk yanmaq. Bərk danlamaq. – Amma elə bərk yuxula ki, hətta get özündən.* M.Ə.Sabir. *Göy tez-tez gurlayır, ildırım şığıyır, hava bərk tutulur.* Ə.Haqverdiyev. [Baxış oğlu Həsənin anası] .. *balabanı da mücrünün dibində bərk gizlədib, oğlunun yerini deməyirdi.* B.Talıblı.

7. Tünd, qəliz. *Bərk çaxır. Bərk tütün. Bərk araq.*

8. *dan.* Xəsis, simic. *Bərk adam.*

9. *İs. mənasında.* Möhkəm yer, əlçatmaz yer. *Bax, buralarda* [düşmənlər] *bərklərdə, girəvələrdə gizləniblər ki, qoşun gəlib oraya düşsün...* S.Rəhimov. *Əhməd özünü isti dağın başına, bərkə verdi.* Ə.Vəliyev.

◊ **Bərk ayağa çəkmək** – b a x **ayaq. Bərk ayaqda** – b a x **ayaq.** *Ana ürəyidir insana dayaq; Odur bərk ayaqda çatan köməyə.* S.Rüstəm. *Qız dedi: – Bərk ayaqda mümkün olar, dayanma.* M.Seyidzadə. **Bərkdən çıxmaq** – b a x **bərkdən-boşdan çıxmaq** (“**bərk-boş**”da). **Bərkə çəkmək (salmaq, qoşmaq, qısnamaq)** – çətin vəziyyətə salmaq, israrla tələb etmək, sıxışdırmaq, imtahan etmək. [Cəbi:] *Çox da bərkə çəkəndə deyir: – Vallah, gedib Dilbər xanıma deyərəm.* N.Vəzirov. *Ustalarım ciddi işləməyini görüb, mənə məhəbbət bəslərdilər. Atamın xatirinə mənə hörmət edib məni çox bərkə*

*salmazdılar.* H.Sarabski. *Reyhanın cavabı Davudu bərkə qısnamışdı.* Mir Cəlal. *Ancaq Dəmirov qocanı bərkə qoşmaq istəmirdi.* S.Rəhimov. **Bərkə düşmək** – çətin vəziyyətə düşmək, darda qalmaq. *Hanna avantüranı sürətlə hiss edən, bərkə düşərsə, özünü müdafiə etməyi bacaran bir qız idi.* M.S.Ordubadi. **Bərkə qalsa** – b a x **bərk ayaqda.** [Ballı:] *Bərkə qalsa lap rayona da gedərəm.* Mir Cəlal.

**bərk-bərk** *zərf* b a x **bərk** 4 və 5-ci mənalarda. *Bərk-bərk qaçmaq. Dediyindən bərk-bərk yapışmaq. – Mən özüm də əvvəl xam düşdüm və keçən il getdim Bakıya, beş manat verdim qəbz aldım və qəbzi bərk-bərk saxladım.* C.Məmmədquluzadə. *Axşamçağı soyuqdan paltonuma bərk-bərk bürünüb, bazardan keçdikdə, gördüm bir dükanın qabağında üç uşaq durub zarıldayır.* Çəmənzəminli. *Günəşin əlindən yapışıb bərk-bərk; Qoynuna uğurlu bir səhər gəlir.* S.Rüstəm.

**BƏRK-BOŞ** *is. dan.* Həyatda qarşıya çıxan çətinliklər, müşkülat, çətin vəziyyət; imtahan, sınaq. [Cəbiş:] *Ömrümdə çox-çox bərk-boş görmüşəm, ancaq hələ .. belə nəgəhan şey görməmişəm.* S.Rəhimov.

◊ **Bərkdən-boşdan çıxmaq** – təcrübəli olmaq, sınaqdan çıxmaq, imtahandan keçmək. *Bərkdən-boşdan çıxmış adam.* – [Qara kişi:] *Elə ki, bir az bərkdən-boşdan çıxdı, .. asan olacaq!* Ə.Əbülhəsən. **Bərkdən-boşdan çıxarmaq** – sınaqdan çıxarmaq, sınaqdan, imtahandan keçirmək, imtahan etmək. **Bərkə-boşa düşmək** – çətin vəziyyətə düşmək. *Bir var Nərimanı qucağından qırağa qoymayasan, .. bir də var bərkdən-boşdan çıxarasan.* Mir Cəlal. **Bərkə-boşa salmaq** – b a x **bərkdən-boşdan çıxarmaq**. [Zahidi] *bərkə-boşa salıb, imtahandan çıxarmaq üçün vasitə axtarıram.* Mir Cəlal.

**BƏRKDƏN** *zərf* Ucadan, səsini ucaldaraq. *Bərkdən ağlamaq. – Onlar* [Xınalıq camaatı] *ədəbiyyatımızın yenilikləri ilə maraqlanır, sual verir, şeir dinlədikcə "yenə-yenə" deyə bərkdən qışqırırdılar.* R.Rza. *Birdən tələbələrdən Merac adlısı bərkdən qışqırdı.* Ə.Vəliyev.

**BƏRKİDİCİ** *sif.* 1. Bərkləşdirici, sağlamlaşdırıcı. *Havanın bərkidici təsiri onun temperaturundan, rütubətindən, küləyin sürətindən asılı olur.*

2. *İs. mənasında, xüs.* Bərkləşdirici, möhkəmləndirici, yapışdırıcı maddə.

**BƏRKİDİLMƏ** "Bərkidilmək"dən *f.is.*

**BƏRKİDİLMƏK** *məch.* 1. Bərk hala gətirilmək.

2. Bağlanmaq, qapadılmaq, qıfıllanmaq. *Quyunun ağzı bərkidildi.*

**BƏRKİMƏ** "Bərkimək"dən *f.is.*

**BƏRKİMƏK** *f.* 1. Bərk hala gəlmək, sərtləşmək, qatılaşmaq, möhkəmləşmək. *Sümüyü bərkimək.* // Qurumaq. *Palçıq bərkiyibdir.*

2. *məc.* Cismən və ruhən möhkəmləşmək, sağlamlaşmaq, qüvvətlənmək. *Canı bərkimək. İdman nəticəsində orqanizm bərkiyir. Mübarizədə bərkimək. – Belə qorxulu fikirlər bir-bir Əsədin sinirlərini yerindən oynadıb, hələ bərkiməmiş bədənini dəhşətli bir titrəməyə salırdı.* B.Talıblı. *Qızlar getdikcə dəyişib qızarır, təmiz hava altında onlar boy atıb bərkiyirdilər.* S.Rəhimov. [Cərgənin] *..əvvəl ehtiyatla atdığı addımları indi bərkiyib qətiləşirdi.* Ə.Əbülhəsən.

3. Artmaq, tezləşmək, cəldləşmək, yeyinləşmək. *Avtomobilin sürəti bərkidi. Getdikcə addımlar bərkidi.*

4. *məc.* Mərhəmətsiz olmaq, sərtləşmək. *Ürəyi bərkimək. Xasiyyəti bərkimək.*

5. Şiddətlənmək, artmaq, güclənmək. *Külək bərkidi. Yağış bərkidi. Öskürəyi daha da bərkidi.*

◊ **Bərkiyib durmaq** – inad etmək, qəti durmaq, dediyindən, tələbindən əl çəkməmək.

**BƏRKİNMƏ** "Bərkinmək"dən *f.is.*

**BƏRKİNMƏK** *f.* 1. Bağlanmaq, örtünmək, qapanmaq, pərçinmək, kiplənmək. *Qapıbaca bərkindi. Maşının hissələri yerbəyer bərkindi.*

2. Öz üstünü, yaxud üzünü bir şeylə örtmək, qapamaq, bərkitmək.

**BƏRKİŞDİRMƏ** "Bərkişdirmək"dən *f.is.*

**BƏRKİŞDİRMƏK** b a x **bərkitmək** 2-ci mənada. *Soyuq su ilə yuyunmaqla bədənini bərkişdirən adamlar bir sıra soyuqdəymə xəstəliklərinə çox az tutulur, daha davamlı və möhkəm olurlar.* Zərgərli.

**BƏRKİŞMƏ** "Bərkişmək"dən *f.is.*

**BƏRKİŞMƏK** *f.* 1. Bərk hala gəlmək, qəlizləşmək, kəsifləşmək, qatılaşmaq.

2. Bax **bərkimək** 1, 2 və 5-ci mənalarda. *Mübarizədə bərkişmək. – Çəkişməyən bərkişməz.* (Məsəl).

**BƏRKİŞMİŞ** "Bərkişmək"dən *f.sif. İşdə, mübarizədə bərkişmiş adam.*

**BƏRKİTDİRMƏ** "Bərkitdirmək"dən *f.is.*

**BƏRKİTMƏ** "Bərkitmək"dən *f.is.*

**BƏRKİTMƏK** *f.* 1. Bağlamaq, örtmək; qapamaq, qıfıllamaq. *Qapını bərkitmək. Darvazanı bərkitmək.* – [Sübhanverdizadə] *əllərini stola dayayıb ayağa qalxdı, qapıları açıb baxdı və arxadan örtüb bərkitdi.* S.Rəhimov. // Bir şeylə bağlayaraq, mıxlayaraq, calayaraq, yapışdıraraq, bənd edərək, ilişdirərək, keçirərək, buraraq möhkəmləndirmək. *İlgəkləri bərkitmək. Vinti burub bərkitmək. Sınıq yeri iplə bağlayıb bərkitmək. Taxtaları mıxlayıb bərkitmək. Şəkilləri divara vurub bərkitmək. – Biri texnik motorların vintlərini bərkidir.* S.Rüstəm. // Bağlamaq. *Gündə bir pulsuzu qəssab əcəl darə çəkər; Bərkidər əl-ayağın, üstünə qəddarə çəkər.* M.Möcüz.

2. Möhkəmlətmək; möhkəm, alınmaz, keçilməz hala gətirmək. [Vaqif:] *Xan, .. bu vəziyyətdə dolaşmamaq üçün vasitə çoxdur: hələlik Qalanı bərkitmək lazımdır.* Çəmənzəminli. [Qızıl Arslan:] *Buna görə də daxildəki düşmənlərlə mübarizəyə başlamadan əvvəl, sərhədləri bərkitmək lazımdır.* M.S.Ordubadi.

3. Cismən və ruhən möhkəmləndirmək, qüvvətləndirmək, sağlamlaşdırmaq. *Günəş, hava, su bədənimizi bərkidən mühüm amillərdir.* – [Kəyan] *bununla da əsgərləri ilə birlikdə həm də öz əsəblərini bərkitmək istəmişdi.* Ə.Əbülhəsən.

4. İsrar etmək, inad göstərmək, sözünün üstündə durmaq. [Cəbi:] *Yüz manat az pul deyil.. Bir az bərkitsən, bəlkə üç yüz də verər.* N.Vəzirov.

5. Sürətini artırmaq, yeyinlətmək.

6. Şiddətlənmək, güclənmək, bərkimək. *Çiskin bərkidirdi. Sol tərəfdə neçə qara keçəli alaçıq görünürdü.* R.Rza.

**BƏRKLİK** *is.* 1. Bərk şeyin halı. *Qəndin bərkliyi azdır. Çörəyin bərkliyi. Qabığın bərkliyi.* – [Mahmud:] *Mənim barmaqlarım kobudluqda, bərklikdə oymaqdan qalmaz.* Ə.Əbülhəsən.

2. Xəsislik, simiclik.

**BƏRKLİKÖLÇƏN** *is. xüs.* Bir cismin bərkliyini ölçmək üçün cihaz və s.

**BƏRQ** *is.* [*ər.*] Şimşək. // Bədii təsvirlərdə. *Bərqü baran sanma kim gördükdə ahü əşkimi...* Füzuli. // Parıltı. ☐ **Bərq etmək** – bax **bərq vurmaq**. *Rövşən etməz yüz min günəş bərq etsə; Bu möhnətdə qaralanmış könlümü.* M.V.Vidadi. **Bərq vermək** – bax **bərq vurmaq**. *Həkimbaşı pulları görəndə gözləri məşəldar pişiyin gözləri kimi bərq verdi.* Ə.Haqverdiyev. **Bərq vurmaq** – parlamaq, par-par parıldamaq, işıqlanmaq, işıldamaq. ..*Günün şüası dərədən tədriclə mütəsaid olan dumanın üstündə bərq vururdu.* M.F.Axundzadə. *Səssiz dərədə bərq vurar şır-şır axan su.* A.Səhhət. *Yüzlərcə şam işıqlarında bərq vuraraq, .. xalçaların üzərinə tökülən bu brilyantlar .. ulduzları andırırdı.* M.S.Ordubadi.

**BƏRQƏRAR** [*fars.* bər və *ər.* qərar] 1. *köhn.* Yerləşmiş, yerləşmə, qərar tapma, dayanma. ..*Kərim xan adlı deyir ki: aləm dörd rüknün üstündə bərqərardır...* M.F.Axundzadə.

2. Əvvəlki halında qalma, sabit olma. [Bəhram:] ..*Pəri ilə yavuqlaşım, sonra yenə əvvəlki halımda bərqəraram.* C.Cabbarlı. [Anketov:] *Filankəs öz vəzifəsində bərqərardır.* Mir Cəlal.

3. Sabit, davamlı, daimi. *Qanun öz hökmündə bərqərardır. – Hər kəs elm oxur, bəxtiyar olur; Millət elm ilə bərqərar olur.* M.Ə.Sabir. *O bizimçün daimidir, bərqərar; Gah incidər könlümüzü, gah açar.* A.Səhhət. ☐ **Bərqərar etmək** – sabitləşdirmək, möhkəmləndirmək, bərpa etmək. *Silahların ümumi azaldılması haqqında məclisin qəbul etdiyi qərar eyni zamanda sülhsevər xalqların möhkəm sülh və beynəlxalq təhlükəsizliyi bərqərar etmək əzminin ifadəsidir.* (Qəzetlərdən). **Bərqərar olmaq** – 1) sabitləşmək, qüvvəyə minmək, həyata keçmək. ..*Bir sözlə, saxtalıqlar üstdə bərqərar olan bir dünya yaratdılar.* B.Vahabzadə; 2) bir yerdə qərar tutmaq, dayanmaq. *Əntərzadə gəlib N. kəndində, şairlər demişkən, "bərqərar"*

*oldu.* Mir Cəlal. *Hər dəfə irəli keçmək, istəyən adam bu qilü qalın qabağında tab gətirməyərək qayıdır və öz yerində bərqərar olurdu.* S.Rəhimov.

**BƏRQƏSD** *zərf* [*fars.* bər və *ər.* qəsd] Qəsdən, bilə-bilə. *Qarpızlarımız var ki, biri bir toğlu boyda. Kəsirsən qıpqırmızı. Elə bil içinə bərqəsd bal töküblər.* Ə.Vəliyev.

**BƏRLİ-BƏZƏKLİ** *sif.* Çox bəzəkli, səliqə ilə bəzənmiş. *..Ağzımı açmamış Gilə xala özünün bərli-bəzəkli qonaq otağına təklif etdi.* Mir Cəlal.

**BƏRMURAD** *sif.* [*fars.* bər və *ər.* murad] *klas.* Muradına yetişmiş, arzusuna çatmış. ☐ **Bərmurad etmək** – muradına çatdırmaq. *Bu gün müştaqi-didarın olanı bərmurad etdin.* M.P.Vaqif.

**BƏRNİ** *is.* İçində piti bişirmək və s. üçün istifadə edilən saxsı qab. // Banka. *Mürəbbə bərnisinin böyrü deşildi.* Mir Cəlal.

**BƏRPA** [*fars.*] Əvvəlki normal halına salma (dağılmış, yıxılmış, xarab olmuş, korlanmış, qırılmış, kəsilmiş şeyi)*;* təzədən qurma (qurulma), təzədən düzəltmə (düzəldilmə), təzədən tikmə (tikilmə), təzələmə (təzələnmə); əvvəlki halına gəlmə (düşmə, gətirmə). *Xalq təsərrüfatının bərpası. Müharibədə dağılmış şəhərlərin bərpası.* ☐ **Bərpa etmək** – 1) əvvəlki halına salmaq, təzədən qurmaq (düzəltmək). *Müharibə nəticəsində dağılmış sənayeni bərpa etmək.* – [Kərim bəy:] *İstehkamçı – mühəndis deməkdir, yəni körpü tikəcək, yolları bərpa edəcək, səngər quracaqsınız.* Mir Cəlal; 2) əvvəlki vəziyyətini (hüququnu və s.-ni) qaytarmaq. *Vəzifəsini bərpa etmək. Hüququnu bərpa etmək;* 3) qaldırmaq. *Mindi bir at molla düşdü yola; Getdi ta məhşər eyləsin bərpa.* S.Ə.Şirvani; 4) *məc.* Yaratmaq, düzəltmək. *Şərqdən əsən nəsim güllərin, çiçəklərin və ağacların yarpaqlarının arasında aşiq və məşuqlar ürəklərini cuşa gətirən bir məqamat bərpa etmiş idi.* Ə.Haqverdiyev. **Bərpa olmaq** – əmələ gəlmək, qalxmaq, törəmək, qopmaq. *Hər birisinin başına şuriş və tüğyan xəyalı düşdü və tezliklə Qəzvində şurişi-əzim bərpa oldu.* M.F.Axundzadə. *Əgər desəm, qiyamət bərpa olmuşdu, inanın.* Ə.Haqverdiyev.

**BƏRPAEDİCİ** *sif. xüs.* Bərpa edən, əvvəlki hala (vəziyyətə, şəklə) salan.

**BƏRRAQ** *sif.* [*ər.*] *şair.* Bərq vuran, parıldayan. *..Günəşin yüksəkdən görünən işıqları sakit, saf, bərraq bir dənizin dalğalarında çimərək bəşəriyyətin gözünü işıldadır.* M.S.Ordubadi.

**BƏRR-BİYABAN; BƏRRÜ BİYABAN** *is.* [*ər.* bərr və *fars.* biyaban] *köhn.* Səhra, ucu-bucağı olmayan bitkisiz, quru çöl. [Cahangir bəy:] *Səadət, tək səndən ötrü xanimanımdan əl çəkib, bərr-biyabana düşmüşəm.* N.Vəzirov. *Seyr edirəm bərr-biyabanları; Quli-biyaban görürəm, qorxmuram.* M.Ə.Sabir.

**BƏRŞİKƏST** [*fars.*] *köhn.* 1. Sınıq çıxma; müflis, müflis olma. ☐ **Bərşikəst olmaq** – sınıq çıxmaq, müflis olmaq.

2. Sınıq çıxmış, müflis olmuş, müflis.

**BƏRTƏRƏF** [*fars.* bər və *ər.* tərəf]: **bərtərəf edilmək** – aradan qaldırılmaq; **bərtərəf etmək** – aradan qaldırmaq; **bərtərəf olmaq** – aradan qalxmaq.

**BƏRZƏX** *is.* [*ər.*] 1. *coğr.* İki qitəni bir-birinə, yaxud qitəni yarımada ilə birləşdirən dar torpaq zolağı.

2. Dini əfsanələrə görə, guya ruhların qiyamətə qədər qərar tutacağı behiştlə cəhənnəm arasında yer. [Şeyx Nəsrulla:] *O sənin öz ixtiyarındadır ki, öləndə düşəsən bərzəx aləminə .. və qatır yekəlikdə əqrəblər gəlib yapışalar bədəninə.* C.Məmmədquluzadə. // *məc.* Əzab və işgəncə yeri.

**BƏS**[1] *əd.* [*fars.*] 1. Yetər, kafi, kifayət. *İş apar, baş gedərsə, qoy getsin; Ad qalır bəs deyilmi millət ilə.* M.Ə.Sabir. ☐ **Bəs demək** – kifayətlənmək, gözü doymaq. **Bəs ki** *köhn.* – 1) olduqca çox. *Əqlin aparıb bəs ki baxır gündə qaraya.* M.Ə.Sabir; 2) o qədər ki. *Bir-birinə bəs ki sancıldı tənimdə oxların; Mürği-ruhum qeydinə oldu mürəttib bir qəfəs.* Füzuli. *Bəs ki dil aşiqi-göftari-şəkərbarındır; İstəyir nitqini, düşnamı duadən seçməz.* S.Ə.Şirvani. **Bəs qədər** – olduqca, çoxlu, lazımınca. *Bəs qədər yedi.* **Bəs olmaq, bəs etmək (eləmək)** – kifayət etmək, yetmək, çatmaq. *Odun ehtiyatı çatacaqmı, şəkər bəs edəcəkmi?* S.Rəhimov. *Bu da deyəsən bəs eləmədi.* Ə.Əbülhəsən. [Camal:] *Gözümlə gördüklərim mənə bəs oldu.* S.Rəhimov.

2. *Əmr şəklində:* **bəsdir, bəsdirin** – yetər, kifayətdir, kifayət edər. *Bəsdir mənə bu saqi ilə badeyi-gülgün.* S.Ə.Şirvani. *Şam*

*ağacı bildi bu keyfiyyəti; Söylədi... Bəsdir, buraxın söhbəti!* M.Ə.Sabir. *Ey qələm! Bəsdir əritdin qəlbi-riqqətpərvəri.* M.Hadi. [Çimnaz:] *Bəsdirin qızlar, nə onu çiçəyə qərq edirsiniz.* Ə.Məmmədxanlı.

**BƏS²** *əd.* Sualı, ya fikri gücləndirmək üçün işlənir. *Bəs harada idin? Bəs bizə nə vaxt gələcəksən? Bəs sənin şeylərin hanı? Bəs bu gün nə edəcəksən? Bəs sabah? – Ey həqqi hər yerdə hazırdır deyən əgri nəzər; Bəs nə mənidən seçərsən Kəbədən bütxanəyi?* Nəsimi. *Rəngü ruyu, cismi, taqəti, canı; Külli varı gedən bəs ağlamazmı?* M.V.Vidadi. *Bəs əlli min manatlıq, ya iyirmi beş min manatlıq ev məgər göbələkdir ki, özü-özünə yerin altından pırtlayıb çıxsın?* C.Məmmədquluzadə. [Nəcəf:] *Bəs sən niyə belə əl-ayağa düşmüsən?* İ.Əfəndiyev.

**BƏSA** *zərf* [*fars.*] *köhn.* Çox, çoxlu, kifayət qədər, bəs qədər. *Ruhum Xizrtək ondan bəsa kəsbi-kəmal etdi.* M.P.Vaqif.

**BƏSARƏT** b a x **bəsirət.** ☐ **Bəsarəti bağlı olmaq (bağlanmaq)** – qafil olmaq, həqiqəti görməmək, gözü bağlanmaq, başa düşməmək, gözü bağlı olmaq. [Qasım:] *Adamın bəsarəti bağlananda bağlanır.* Ə.Haqverdiyev.

**BƏSİ** [*fars.*] *köhn.* Çox, çoxlu, xeyli. *Canım gedəni, bəsi zamandır; Cismimdəki indi özgə candır.* Füzuli. *Sərü simayi-cananı çəkiblər bir-birindən xoş; O ki çeşmi-siyəh məstdir, bəsi şahanə yazmışlar.* Q.Zakir.

**BƏSİRƏT** *is.* [*ər.*] Bir şeyi dərindən və tez anlama qabiliyyəti, gələcəyi görmə qabiliyyəti. *İkinci iddia bəsirət sahibləri yanında qətiyyən etibardan saqidir.* M.F.Axundzadə. ☐ **Bəsirət gözü** – idrak, anlaq, düşüncə. *Leyk, hanı səndə bəsirət gözü; Ta görəsən vəchi-dilarasını?* M.Ə.Sabir. [Qulamın] *qorxaqlığından, bəsirət gözünün bağlılığı üzündən düşdüyü bu vəziyyəti qiymətləndirə bilməyən bu adam hələ də özünə gəlməmişdi.* Ə.Əbülhəsən.

**BƏSİRƏTLİ** *sif.* Bir şeyin əsil və həqiqətini dərindən və tez anlayan, qabağı görən; gözüaçıq, idraklı. *Bəsirətli adam.*

**BƏSİRƏTLİLİK** *is.* Bəsirətli adamın xassəsi; gözüaçıqlıq, idraklılıq.

**BƏSİRƏTSİZ** *sif.* Bəsirəti olmayan, gələcəyi görməyən.

**BƏSİRƏTSİZLİK** *is.* Bəsirəti olmama, gələcəyi görməmə. *İnsanların bəsirətsizlik və mərifətsizliyinin nəticəsində hicrətdən ta bu günə qədər avamı aldadanlar .. fitnə-fəsad törətmişlər.* M.F.Axundzadə.

**BƏSİT** *sif.* [*ər.*] Tərkibi bir ünsürdən ibarət olan; mürəkkəb olmayan, sadə (*mürəkkəb* əksi). *Bəsit maddə.*

**BƏSİTLƏNDİRMƏK** b a x **bəsitləşdirmək.**

**BƏSİTLƏNMƏK** b a x **bəsitləşmək.**

**BƏSİTLƏŞDİRİLMƏ** "Bəsitləşdirilmək"dən *f.is.*

**BƏSİTLƏŞDİRİLMƏK** *məch.* Bəsit hala salınmaq.

**BƏSİTLƏŞDİRMƏ** "Bəsitləşdirmək"dən *f.is.*

**BƏSİTLƏŞDİRMƏK** *f.* Bəsit şəklə salmaq, sadələşdirmək.

**BƏSİTLƏŞMƏ** "Bəsitləşmək"dən *f.is.*

**BƏSİTLƏŞMƏK** *f.* Daha bəsit (sadə) olmaq, sadələşmək.

**BƏSİTLİK** *is.* Bəsit şeyin halı; sadəlik.

**BƏSLƏMƏ** "Bəsləmək"dən *f.is.*

**BƏSLƏMƏK** *f.* 1. Tərbiyə edib böyütmək, boya-başa çatdırmaq. *Madərləriniz etdi sizə mehrü məhəbbət; Ağuşi-şəfəqqətdə sizi bəslədi rahət.* M.Ə.Sabir. *Anadır hər kişiyə öz vətəni; Bəsləyib sinəsi üstündə onu.* A.Səhhət. // Yetişdirmək, becərmək. *Körpə heyvanları bəsləmək. – İpək qurdlarını bəsləmək üçün respublikamızın alimləri iriyarpaqlı yaxşı ipək verən zərif tut ağacları yetişdirmişlər.* M.Axundov.

2. Qidalandırmaq, yedirmək, yedirib-içirtmək, yedirib-kökəltmək. *Ətlik qoyunları qidalı yemlərlə bəsləmək. – Cəm edəcək tarlasının hasilin; Bəsləyəcək ailəsin, həm elin.* M.Ə.Sabir.

3. *məc.* Qorumaq, saxlamaq. *Bəbəktək bəslədim daim gözümdə xali-hinduni.* Nəsimi.

4. Duymaq, hiss etmək, ürəyində saxlamaq. *Onların hamısına eyni hiss və münasibət bəslədiyim halda, bir dəstə gülü kimə verəydim?* Mir Cəlal.

5. "Etmək" sözünün sinonimi kimi bəzi isimlərə qoşularaq, mürəkkəb feil düzəldilir; məs.: ümid bəsləmək, etibar bəsləmək, nifrət bəsləmək.

**BƏSLƏNMƏ** "Bəslənmək"dən *f.is.*

**BƏSLƏNMƏK** 1. "Bəsləmək"dən *məch.* *Bəslənmək istəyirəm bütün ürəklərdə mən arzu, diləklər kimi.* B.Vahabzadə.

2. *t-siz.* Qidalanmaq, qida almaq (yemək). *Pişiklər ətlə, inəklər isə otla bəslənir. İnsan bədəninin hüceyrələri oksigen ilə bəslənir.*

**BƏSLƏYİCİ** *sif.* 1. Tərbiyə edib böyüdən, boya-başa çatdıran, yetişdirən, becərən. // Mənəvi qida verən. *Ana! Sənin tükənməz əməyin, oxşayıcı şəfqətin, bəsləyici məhəbbətin, qəlb ülviyyətin kimə məlum deyil!* Mir Cəlal. // İs. mənasında. *Uşağın bəsləyicisi anadır.*

2. Qidalandırıcı, qidalı, qida verən. *Bəsləyici maddələr.*

**BƏSLƏYİŞ** *is.* Bəsləmə işi, bəsləmə.

**BƏST** *is.* [*fars.*] *tar.* İranda hökumətin təqibindən və ya dini təqibdən qaçıb xarici səfarətxanalara və ya ziyarətxanalara pənah aparan şəxsin daldalandığı yer, sığnaq. *Burada da, Təbrizdə olduğu kimi, bəst vardır.* M.S.Ordubadi. *Hacı Mirzə Əhməd ağanın evi "bəst" hesab olunurdu.* Ə.Haqverdiyev. ◻ **Bəstə girmək** – təqibdən qaçaraq, müqəddəs sayılan bir yerə, yaxud nüfuzlu bir adamın evinə pənah gətirmək, oraya sığınmaq. [Mirzə Əhməd:] *Get, o bəstə girən oğlana xəbər ver ki, mən Hacı Kamyab ilə görüşüb onunla lazım olan söhbəti elədim.* Ə.Haqverdiyev. *Girərdi bəstə adam öldürən zaman qatil; Ona himayət edən şəxs əhli-mənbər idi.* M.Möcüz. [Molla:] *Hərçənd ki, ağa bəstə girənləri qəbul eləmir, amma eybi yoxdur.* P.Makulu.

**BƏSTƏ$^1$** [*fars.*] 1. *köhn.* Bağlı. *Əqlü huşum mənim, fikrü xəyalım; Şux gözdə, qəmzədə bəstədir, ay qız!* M.P.Vaqif.

2. Musiqi kompozisiyası. *Musiqinin bəstəsi.* // *məc.* Nəğmə, hava, mahnı, musiqi. *Seyr et bu varlığı, şeyda bülbülüm! Həyata müjdədir hər yeni bəstən!* S.Vurğun.

**BƏSTƏ$^2$** *sif.* Bir qədər alçaq. *Mən Sonayam boyu bəstə; Dərdindən olmuşam xəstə.* Aşıq Sona. *Eldə bir qız sevmişəm; Alagöz, boyu bəstə.* (Bayatı). *O bəstə dilbərim sözdən küsməsin; Rəhmin, şəfahətin bizdən kəsməsin.* (Qoşma).

**BƏSTƏBOY** *sif.* Boyu bir qədər alçaq, qısa. *Bəstəboy oğlan, qız.*

**BƏSTƏKAR** *is.* [*fars.*] 1. Musiqi əsərləri yaradan şəxs, kompozitor. *Azərbaycan musiqisində çoxsəslilik problemini düzgün həll etmək məsələsi hal-hazırda bəstəkar və musiqişünasları düşündürməkdədir.* Ü.Hacıbəyov. *Musiqi bəstəkarları da .. şeirləri "notaya" düzüb, musiqiyə salıblar.* C.Məmmədquluzadə. *Val sürətlə hərlənir. Gənc bir Azərbaycan bəstəkarı tərəfindən yazılmış xəfif melodiya .. talvardan uzaqlara qanad çalır.* İ.Əfəndiyev.

2. *məc.* Müğənni, tərənnümçü mənasında.

**BƏSTƏKARLIQ** *is.* Musiqi əsərləri yazma sənəti, musiqi əsərləri müəllifliyi, bəstəkar sənəti; kompozitorluq.

**BƏSTƏLƏMƏ** "Bəstələmək"dən *f.is.*

**BƏSTƏLƏMƏK** *f.* Musiqi əsəri yazmaq, hava qoşmaq, havaları nota salmaq. *"Şur" ladı üstündə melodiya bəstələrkən, müvafiq fəsildə "Rast" ladına dair göstərilmiş qaydalara riayət edilməlidir.* Ü.Hacıbəyov. *Musiqini ən qoca bir sənətkar bəstələmiş olsa, onu bir ixtiyar xanəndə oxusa belə, yenə də onda bir gənclik mövcuddur.* M.S.Ordubadi.

**BƏSTƏLƏNMƏ** "Bəstələnmək"dən *f.is.*

**BƏSTƏLƏNMƏK** *məch.* Musiqisi yazılmaq, musiqi qoşulmaq, hava qoşulmaq; notaya salınmaq, musiqi ahənginə uydurulmaq.

**BƏSTƏLƏNMİŞ** *f.sif.* Yazılmış, qoşulmuş, notaya salınmış, musiqi ahənginə uydurulmuş.

**BƏSTƏR** *is.* [*fars.*] Yataq, yorğan-döşək. *..Bəstəri-möhnətdə xəstə olduğum; Deyən varmı biinsafa görəsən?* Q.Zakir. *Nə yatıbsan lihaf, bəstər içində; Bimar isə nədir bəs halın sənin?* Aşıq Pəri. *Gövhərtac .. iki gün salamat görünəndə, üç gün bəstərdə yatırdı.* Ə.Haqverdiyev.

**BƏSTƏRİ** *sif.* [*fars.*] Yorğan-döşəyə düşmüş (xəstə haqqında). *Gövhərtac da o gündən bəstəri naxoşdur.* Ə.Haqverdiyev.

**BƏSTİ** *is.* Kiçik küp, küpə. *Yağ salıb, bağlayıb cümlə göbək; Hər biri yağ ilə dolan bəsti tək.* S.Ə.Şirvani. [Zeynəb:] *Mən də bir bəsti şərab alıb, ora gedərəm.* M.S.Ordubadi.

**BƏŞARƏT** *is.* [*ər.*] Muştuluq, müjdə, xoş xəbər, gözaydınlığı. *Xövfi-xətadə müztəribəm, var ümid, kim; Lütfən verə bəşarətiəfvü əta mana.* Füzuli.

**BƏŞAŞƏT** *is.* [*ər.*] *klas.* Gülərüzlülük, üzüaçıqlıq; sevinc. *Mövlana başaşət zahir edib dedi ki: – Dəxi qəm çəkməyin, şuriş dünən vaqe olubdur.* M.F.Axundzadə. *Məsum uşağın bu halətindən; Madər sevinər başaşətindən.* A.Səhhət.

**BƏŞƏR** *is.* [*ər.*] İnsan, adam. *Bu sifətdə kim görübdür bəşəri cahan içində?* Nəsimi. *Olmuşdu bəşərdən öylə bizar; Kim, öz əksin sanırdı əğyar.* Füzuli. *Bu hüsn lətafətdə yəqindir bəşər olmaz.* S.Ə.Şirvani. *Biz belə bir qəhrəmanlıq görməmişik bəşərdə.* S.Rüstəm. // Toplu mənada. *Kamalın, hüsnün eşqilə bəşər cənnət yaratmışdır.* S.Vurğun. *Qütbün ilk körpüsü olan bu uçuş; Bəşərin ən qədim bir arzusudur.* Ə.Cəmil.

◊ **Növi-bəşər** – insanlar. *Məktəblə qılar növi-bəşər dəfi-bəlaya; Məktəblə çıxar zahirə əsrari-xəfaya...* M.Hadi.

**BƏŞƏRƏ** *is.* [*ər.*] *klas.* Bədəni örtən dərinin xarici təbəqəsi. // İnsanın xarici görünüşü, üzü. *Elə ki, hamısı qayib oldu, Yusif şah xacə Mübarəki yanına çağırıb dedi ki: – Sənin bəşərəndən mən görürəm ki, sən gərək yaxşı adam olasan.* M.F.Axundzadə.

**BƏŞƏRİ** *sif.* [*ər.*] İnsana, bütün insanlara aid olan; insana məxsus olan; insana xas olan; insani. *Bəşəri hisslər. – Bu dövlət, quruluş, torpaq sənindir; Ən uca bəşəri diləyə hörmət.* A.Şaiq. *Çünki məhəbbət yalnız sevinc deyil, məhəbbət eyni zamanda yüksək bəşəri bir vəzifə idi.* Ə.Məmmədxanlı. *..Onların* [Bahadır və Sonanın] *faciəsi hər şeydən əvvəl ictimai, bəşəri bir faciə kimi səslənir.* M.Arif.

**BƏŞƏRİYYƏT** *is.* [*ər.*] İnsanlıq, insanlar. *Bütün tərəqqipərvər bəşəriyyət sülhün keşiyində durmuşdur. – Günəşin yüksəkdən görünən işıqları . . saf, bərraq bir dənizin dalğalarında çimərək, bəşəriyyətin gözünü işıqlandırır.* M.S.Ordubadi. [Bəhram:] *Qanun qarşısında bütün bəşəriyyət bərabər olmalıdır.* C.Cabbarlı. *İllərcə çalışmış bəşəriyyət; Varlıqdakı şimşəklə, küləklə.* M.Müşfiq.

**BƏŞƏRTA, BƏŞƏRTİ** *bağl.* [*fars.* bə və *ər.* şərta] (bəzən "ki" ilə: **bəşərti ki**) *köhn.* Bu şərtlə, bu şərtlə ki. [Hacı Qara:] *..Mən yağ ilə də sövdə edərəm, bəşərti ki xalis inək yağı ola.* M.F.Axundzadə. [Mirzə:] *..Amma bəşərti ki, toyunu da tez eyləyəsən ha!* Ə.Haqverdiyev. [Hacı:] *Şəriət sahibi deyir oxu, elm kəsb elə, bəşərti ha isməti, irzi, namusu mühafizət elə!* Mir Cəlal.

**BƏŞŞAŞ** *sif.* və *zərf* [*ər.*] *klas.* Gülərüzlü, fərəhli, şad. *Bəşşaş oturub yanında madər; Hərdən beşiyin əl ilə yellər.* A.Səhhət.

**bi**... [*fars.*] İsimlərin əvvəlinə gətirildikdə inkar və yoxluq mənasında sifət düzəldən və -siz/-süz mənasını verən şəkilçidir; məs.: biədəb, biinsaf, bivəfa və s.

**BƏT-BƏNİZ** *is.* b a x **bəniz.** *Şiddətli ildırımdan Günəş bağırdı. O birilərində də bət-bəniz qalmadı.* A.Şaiq. *Üçgünlük dəniz səfəri çoxu gəmiyə minməmiş əsgərdə bət-bəniz qoymamışdı.* Ə.Əbülhəsən. [Pərzad:] *Buna bax! Qızın bət-bənizi qalmayıb ha!* Mir Cəlal. ☐ **Bət-bənizdən olmaq** – b a x **bət-bənizi ağarmaq (qaçmaq, uçmaq)**. *Yoldaşım bunların səsini eşitcək, bət-bənizdən olub özünü itirdi.* Çəmənzəminli. **Bət-bənizi ağarmaq (qaçmaq, uçmaq)** – qorxudan və ya qəfildən verilən pis xəbərdən, xəstəlikdən və s. nəticəsində üzünün rəngi qaçmaq, ağarmaq. *Humay .. bət-bənizi uçmuş və məhzun halda düşünür.* H.Cavid.

**BƏTN** *is.* [*ər.*] Qarın. *Mənə elə gələrdi ki,* [Azad] *ana bətnindən lüt-ətcə bu soyuq dünyaya .. qədəm qoyduğu zaman belə səsini çıxarmamışdır.* M.İbrahimov.

**BƏY** *is.* 1. Tarixən Qafqazın müsəlman əhalisi arasında zadəgan təbəqəsinə mənsub olan, zəngin, irəli gələn şəxs. *Alimdə əməl yox, bəydə ədalət.* Q.Zakir. *Bağın, əkinin xeyrini bəylər görəcəkmiş; Toxm əkməyə dehqanları neylərdin, ilahi?!* M.Ə.Sabir. *Mədənlərdə, fabrik və zavodlarda işləyən fəhlələr, bəyin zülmündən və aclıqdan qaçıb, iş axtarmağa gəlmiş kəndlilər, kasıblar "Çəmbərəkənddə" yaşayırdılar.* S.Rəhman. // Bu zümrəyə mənsub adamların adına əlavə edilən ləqəb. *Bəy dediyin nədir, bəyənmədiyin nə?!* (Məsəl).

2. *tar.* Başçı, rəis, hakim. *Əşirət bəyi. – Bəylə bostan əkənin tağı çiynində bitər.* (Ata. sözü).

3. *məc.* Hökmran, hakim, ağa mənasında. *Dərə xəlvət, tülkü bəy.* (Ata. sözü).

4. Ümumiyyətlə, oxumuş adamlara ehtiram əlaməti olaraq verilən ləqəb. *Bacı,*

*qabağa gəlin, sözünüzü müəllim Həbib bəyə deyin.* S.Rəhman.

5. *etnoqr.* Toyu edilən, evlənən oğlan. *Toyun üçüncü gecəsinin sabahı bəyi hamama aparardılar*. H.Sarabski.

◊ **Ac bəy, quru bəy** *köhn.* – iflas etmiş, var-yoxu əlindən çıxmış bəy, mülkədar; // yoxsul, lakin lovğa adam haqqında.

**BƏYAN** *is*. [*ər.*] 1. Anlatma, izah etmə, şərh etmə, aydın və açıq söyləmə; izah, şərh, ifadə. *Həkimin bəyanına görə, taxıl çöplərini qırıb yerə tökən həmin bu qurd imiş*. C.Məmmədquluzadə. *Görmüşəm çox gözəl-gözəl şeylər; Söyləsəm gər, bəyanı tul çəkər*. A.Səhhət. *Bir aləmdir o, təsvirə, bəyana sığmaz; Şerin qurub yaratdığı cahana sığmaz.* R.Rza. □ **Bəyan etmək (qılmaq)** – söyləmək, bildirmək, izah etmək, anlatmaq. *Eşqin mərəzinə bən də təbibəm; Bəyan elə bana əhvalın sənin*. Aşıq Pəri. *Sədrəddin bəy prokurorun hücrəsində bir saat çağı qalıb əhvalatı bəyan edirdi*. S.M.Qənizadə. *Cütçü dedi: – "Bircə mənə qıl bəyan; Sərçə veribdirmi sənə bir ziyan?"* A.Səhhət. *"Leyli-Məcnun" hekayəsinin səbəbi nəzmini bəyan qıldığı saqinamədə Füzuli deyir: bu "bir bəzmi-müsibəti-bəladır ki, onun əvvəli qəm, sonu bəladır"*. F.Köçərli. **Bəyanə gəlmək** – dilə gəlmək, danışmağa başlamaq.

2. *ədəb. köhn*. Poetikanın təşbeh istiarə, məcaz və kinayə kimi qisimlərindən bəhs edən hissəsi.

**BƏYANAT** *is.* [*ər.*] 1. Bir məsələ və s. haqqında hökumət və ya bir idarənin rəsmi məlumatı. *Xarici İşlər Nazirliyinin bəyanatı. Bəyanat vermək.*

2. İfadə, izahat. [Mirzə Həsən:] *Mirzə Məmmədəli, mən səndən xahiş edirəm, hövsələ eliyəsiniz və bəyanatınızı başa yetirəsiniz.* C.Məmmədquluzadə.

**BƏYANNAMƏ** *is*. [*ər.* bəyan və *fars.* namə] Xalqa, xalqlara, camaata xitabən yazılı müraciət; müraciətnamə. *Bəyannamə nəşr etmək. Ümumdünya Sülh Tərəfdarları konqresinin bəyannaməsi.*

**BƏYAZ** [*ər.*] 1. *sif.* Ağ (rəng). *Bəyaz gərdəninə siyah tel düzər; Sanasan sonamdır mənim sevdiyim.* M.P.Vaqif. *Gülüşür pənbə, al bəyaz güllər; Ötüşür hər tərəfdə bülbüllər.* H.Cavid. [Kərim kişinin] *boynu, boğazının altı və bütün siması bəyaz tüklərlə örtülmüşdü.* M.İbrahimov. □ **Bəyaz gecə(lər)** – b a x **ağ gecə(lər)** (**"ağ"**da). *Burda Çaykovski öz zəkasını; Verib sənətinə bəyaz gecələr; Yazdı romansını, simfoniyasını.* M.Rahim. *Biz artıq bəyaz gecələr davam edən şimal məntəqəsinə daxil olduq.* Ə.Məmmədxanlı.

2. B a x **bayaz** 2-ci mənada. *Savadlı gənclərin bəyazı olardı, bu bəyazlara ana dilindəki şeirlərin nəfis parçaları köçürülər, əzbərlənərdi.* Çəmənzəminli.

**BƏYAZLANMA** "Bəyazlanmaq"dan *f.is.*

**BƏYAZLANMAQ** *f.* Ağarmaq, ağ rəng almaq. *Pərdə bəyazlandı, lampalar söndü, kino verilişi başlandı.* Mir Cəlal.

**BƏYAZLIQ** *is*. Ağlıq.

**BƏYDADAŞ** *is*. Zarafatla və ya ciddi müraciət. [Gəray ağa:] *Bilirsən, bəydadaş, işlər necə hălləm-qălləmdir?* S.Rəhimov. *Bir gün onun istədiyi mühazirəçini göndərdilər və kişinin özünə də xəbər verdilər ki: – Bəydadaş, gözün aydın, mühazirəçi gəlib, sərəncamınızı gözləyir.* "Kirpi".

**BƏYƏM** *dan.* b a x **məgər**. [Ana:] *Qardaşın qızıl güllə qabağındadır. Mən bəyəm onlardan artığam?* Mir Cəlal. [Şamamanın atası:] *Bəyəm o vaxt biz səninlə bu talvarda oturub, belə arxayın söhbət edə bilərdik?* İ.Əfəndiyev.

**BƏYƏNDİRMƏ** "Bəyəndirmək"dən *f.is.*

**BƏYƏNDİRMƏK** *icb.* 1. Birinə bir şeyi, yaxud bir çox şeyləri göstərərək aralarından birini seçdirməyə, qəbul etdirməyə çalışmaq. *Ona hər şeyi bəyəndirmək çox çətindir.*

2. Xoşuna gəlməsinə, bəyənməsinə çalışmaq, məziyyətlərini qəbul və təqdir etdirmək. *..Hər ikisi keçmiş igidliklərindən söyləyir, öyünməyə və hər biri özünü bəyəndirməyə çalışırdı.* A.Şaiq. *Onların hər ikisi özünü Mahruya bəyəndirmək üçün gündə bir neçə libas geyir və bir neçə qiyafətə girirdi.* M.S.Ordubadi.

**BƏYƏNİLMƏ** "Bəyənilmək"dən *f.is. Nadirin bəyənilməsi Məstan bəyi razı saldı və marağını daha da artırdı.* B.Talıblı. *Çoxaldı get-gedə dostlar, tanışlar; O da bəyənildi, o da bəyəndi...* S.Vurğun.

**BƏYƏNİLMƏK** *məch.* Xoşa gəlib qəbul edilmək; seçilmək, üstün tutulmaq.

**BƏYƏNİŞ** *is.* Bəyənmə, bəyənib qəbul etmə, seçmə.

**BƏYƏNMƏ** "Bəyənmək"dən *f.is.*

**BƏYƏNMƏK** *f.* 1. Zövqünə, ruhuna, təbiətinə uyğun gəldiyi üçün bir şeyi xoşlamaq; yaxşı bilib qəbul etmək, təqdir etmək; ürəyinə yatmaq. *Bu parçanın rəngini bəyənmədim. Onun əsərini çox bəyəndilər.* – [Molla Qasım] *...Güllücə kəndini bəyənib seçmişdi.* S.S.Axundov. *Bəyəndiyi qızlar* [Məmmədbağıra] *gəlməyirdi.* S.Hüseyn. *Xəlil onun sözlərini bəyənib güldü və qadına tərəf baxdı.* M.Hüseyn.

2. Məqbul, yaxşı, düzgün hesab etmək, tərifə layiq görmək, bir şey haqqında yaxşı fikirdə olmaq. *Onun sözlərini hamı bəyəndi. İclas irəli sürülən təklifləri bəyəndi.*

3. Saymaq. *O heç kəsi bəyənmir.*

◊ **Özünü bəyənən** – başqasını saymayan, bəyənməyən; mütəkəbbir, lovğa, özü haqqında böyük fikirdə olan.

**BƏYƏNMƏZLİK** *is.* Bəyənməmə, xoşlanmama, qəbul etməmə. // Saymazlıq, saymama.

**BƏYİM** *is. köhn.* "Bəy" sözünün qadın forması; xanım (adətən bəzi mürəkkəb qadın adlarının ikinci hissəsini təşkil edir).

**BƏYİMBACI** *is. dan.* Hörmət üçün qonşu və ya başqa qadınlara verilən ad.

**BƏYİMÇÖRƏYİ** *is. aşp.* Yumurta, yağ və süd qarışdırılmış buğda unundan bişirilən qoğal. [Bağbaşıdan] *əlavə oğlan evində şəkərbura, şəkərçörəyi, bəyimçörəyi .. hazırlayıb, .. qız evinə göndərərdilər.* H.Sarabski.

**BƏYİRİŞMƏ** "Bəyirişmək"dən *f.is.*

**BƏYİRİŞMƏK** *qarş.* Ağız-ağıza verib bəyirmək.

**BƏYİRMƏ** "Bəyirmək"dən *f.is.*

**BƏYİRMƏK** *f.* Səs təqlidini bildirən söz; daha çox kiçik buynuzlu və balaca heyvanların səslənmələri. *Dana anasının dalınca bəyirirdi. – Gedə, nə belə payız buzovu kimi bəyirirsən?* M.S.Ordubadi.

**BƏYİRTİ** *is.* Bəyirən heyvanın səsi.

**BƏYİRTMƏ** "Bəyirtmək"dən *f.is.*

**BƏYİRTMƏK** *icb.* Bəyirməyə məcbur etmək, çığırtmaq, bağırtmaq.

**BƏYLƏRBƏYİ** *is. tar.* Keçmişdə İranda və Azərbaycanda vilayət hakimi. *Amma siz durun gedin Qəzvinin köhnə bəylərbəyisinin yanına, onu dəxi razı edin..* M.F.Axundzadə. *Bəylərbəyinin elçilərinə rədd cavabı vermək xanlıqla şahənşahlıq arasında soyuqluq və etimadsızlıq doğura bilərdi.* Çəmənzəminli.

**BƏYLİK** *köhn.* 1. *sif.* Bəyə məxsus, bəyə mənsub. *Bəylik mülk.*

2. *is. məc.* Ağalıq, hökmranlıq. *Bəyliyi başarmadın, canın çıxsın belə gəz.* (Məsəl). *Müctəhid və şeyxülislamların cövlanı idi və xəlvət dərədə növ-növ tülkülərin bəyliyi idi.* C.Məmmədquluzadə. // *məc.* Məclisdə sədrlik, rəhbərlik, başçılıq, böyüklük. *Süfrənin bəyliyi əksəriyyət səslə çar konsuluna tapşırıldı.* M.S.Ordubadi.

3. *sif. etnoqr.* Bəyə (5-ci mənada) məxsus. *Şahsənəm gəlin otağına keçdi. Qərib bəylik paltarını geyib, Şahsənəmin yanına gəldi.* "Aşıq Qərib".

**BƏYZADƏ** *is. köhn.* [*fars.*] Bəy oğlu, bəy nəslindən olan adam. *Şəhərlərdə, kəndlərdə və obalarda yaşayan xanzadələrimiz, bəyzadələrimiz, .. oxumaq və yazmaq bilmirlər.* M.F.Axundzadə. *Bunların arasında bəyzadə-zad yoxdur, hamısı fağır adamlardır.* N.Nərimanov. *Bu iki uşağın arasında böyük fərq vardı, birinin atası bəyzadə, o birininki yoxsul idi.* S.S.Axundov.

**BƏYZADƏLİK** *is. köhn.* Bəy nəslinə mənsubiyyət.

**BƏZ** b a x **bəzi.**

**BƏZƏDİLMƏ** "Bəzədilmək"dən *f.is.*

**BƏZƏDİLMƏK** *məch.* Bəzək vurulmaq, zinətləndirilmək.

**BƏZƏK** *is.* Bəzəyən şey, gözəllik verən şey; zinət, yaraşıq. *Divar bəzəyi.* // Cavahirat mənasında. *Qadın bəzəyi. Bəzək vurmaq.* – *Bəzək-bəzək ki, deyirlər, cavahirat deyil! Cavahirat bu gün zinəti-həyat deyil! M.Ə.*Sabir. [Qətibə:] *Mənim qiymətli zinətlərimi gətirin, bəzək şeylərini hazır edin.* M.S.Ordubadi. *Qızlar bütün bəzəklərini taxmışlar, üst-başları rəngdən-rəngə girərək alışıb-yanır.* S.Rüstəm. // Məc. mənada. *Melodiya bəzəklərini yazarkən, hər cür şərti işarələri bir qoyub, bütün notları kiçik şəkildə yazmaq lazımdır.* Ü.Hacıbəyov. ☐ **Bəzək bəzəmək** – b a x **bəzəmək** 2-ci mənada. **Bəzək qoymaq** – b a x **bəzəmək** 2-ci mənada. **Bəzək vermək** – b a x **bəzəmək.**

**BƏZƏKÇİ** *is.* 1. Bəzək vuran, bəzək verən, bəzək işləri ustası.

2. *etnoqr*. Köhnə məişətdə: gəlin köçürülən qızları, yaxud varlı evlərdə qadınları bəzəndirib geyindirən. *Bəzəkçi qadınlar içəri girdilər.* M.S.Ordubadi.

3. *məc. dan.* Adamı bəzəyən, adama söz qoşan.

**BƏZƏKÇİLİK** *is*. Bəzəkçinin işi, sənəti.

**BƏZƏK-DÜZƏK** *is. isteh.* Bəzək, bəzək şeyləri, lüzumsuz bəzək. *Özünə bəzək-düzək vermək. – Bil ki, insan ziynəti; Bəzək-düzək deyildir.* R.Rza. *Firidun bəzək-düzək altında itmiş .. bu qızın qəribə mühakimələrinə qulaq asır və heyrət edirdi*. M.İbrahimov. *Mehman yeni gördüyü evə nəzər saldı, onun zəngin bəzək-düzəyini ötəri seyr edib əyləşdi.* S.Rəhimov.

**BƏZƏKLƏNMƏ** "Bəzəklənmək"dən *f.is.*

**BƏZƏKLƏNMƏK** *f. dan*. 1. Özünə bəzək vurmaq, özünü bəzəmək.

2. Bəzənmək, gözəlləşmək. *Bəzəklənir-düzəklənir, bağın fəzası rənglənir*. A.Səhhət. *Hünər gözəl, qüvvət gözəl, qol gözəl; Musanın sazında tel bəzəklənib.* Aşıq Musa.

**BƏZƏKLİ** *sif*. Bəzək vurulmuş, bəzənmiş; zinətli. *Bəzəkli ev. Bəzəkli mağaza. – Çox çəkmədi, bayram mərasimini andıran bəzəkli qatar gəldi.* Mir Cəlal. // Naxışlı, şəkilli. *Üfüqlərdə günəş güldüyü zaman; Üstünə bəzəkli yumşaq taftadan; Alafa çəkərdi, nazlardı səni*. R.Rza. *Qaraş özünə məxsus şirin-şirin gülərək, cibindən çıxardığı yanları bəzəkli ağ dəsmalla gözünü sildi*. M.İbrahimov. // Məc. mənada. *Bəzəkli yurdumuz çiçək-çiçəkdir; Hər keçən ömrümüz bir gələcəkdir.* S.Vurğun.

**BƏZƏKSİZ** *sif.* və *zərf* Heç bir bəzəyi, zinəti olmayan, sadə, adi. *Bəzəksiz otaq. Bəzəksiz paltar*. – [Xeyransa:| *Qız bəzəksiz-düzəksiz ev paltarında qəfildən çıxdı bizim qabağımıza..* H.Sarabski. *Şeirlərin məzmunudur bəzəksiz üz, gül dodaq.* M.S.Ordubadi.

**BƏZƏMƏ** "Bəzəmək"dən *f.is.*

**BƏZƏMƏK** *f.* 1. Zinətləndirmək, yaraşıq vermək, gözəlləşdirmək, qəşəngləşdirmək, nəzəri cəlb edəcək gözəl bir vəziyyətə salmaq. *Evləri bayraqlarla bəzəmək. Seçki məntəqəsini bəzəmək. – Göy üzünü bəzər parlaq ulduzlar.* H.Cavid.

2. *məc.* Mübaliğəli şəkildə təsvir etmək. *Möhlətovu divar qəzetində də möhkəm bəzədilər.* Mir Cəlal.

**BƏZƏN** *zərf* [*ər.*] Bəzi vaxt, bəzi hallarda, arabir, gah-gah. *Bəzən başım ağrıyır. O bəzən bizə gələrdi. Su bəzən yaxşı gəlir, bəzən pis.* – [Qətibə] *bəzən Hüsaməddindən şübhələnir və onun Toğrul tərəfinə keçdiyini zənn edərək rahatsız olurdu.* M.S.Ordubadi. *Atlarımızın qabağından bəzən bir çoban-aldadan, bəzən də .. sarıköynək .. qalxırdı.* İ.Əfəndiyev. *Maralın vahiməsi Cumanı bəzən min cür pis fikrə, şübhəyə salırdı.* Ə.Əbülhəsən.

**BƏZƏNDİRMƏ** "Bəzəndirmək"dən *f.is.*

**BƏZƏNDİRMƏK** *f.* Bəzəmək, yaraşıqlı paltar geyindirmək. [Qarovulçu:] *Fabriklərə axar pambıq selləri; Mal toxunar, bəzəndirər elləri.* Ə.Haqverdiyev.

**BƏZƏNİB-DÜZƏNMƏ** "Bəzənib-düzənmək"dən *f.is.*

**BƏZƏNİB-DÜZƏNMƏK** b a x **bəzənmək** 1-ci mənada. *Qız da hərəmxanada bəzənər-düzənər, hazırda oğlan evindən oğlan yengə gəlməyə müntəzir olar.* R.Əfəndiyev. *Görənlər tanıyır bu alma yanaq; Bəzənib-düzənmək bilirdi ancaq.* M.Rahim. *Ceyran tərtəmiz geyinib-kecinmişdi, bəzənib-düzənmişdi.* Mir Cəlal.

**BƏZƏNİLMƏK** b a x **bəzədilmək.**

**BƏZƏNİŞ** *is.* Bəzənmək işi, bəzənmə.

**BƏZƏNMƏ** "Bəzənmək"dən *f.is.*

**BƏZƏNMƏK** 1. *qayıd.* Özünə zinət vermək, özünə bəzək vurmaq; yaraşıqlı geyinmək. *Güzgünün qabağında bəzənmək.*

2. *məch.* Bəzək vurulmaq, zinətləndirilmək, yaraşığa salınmaq, gözəlləşdirilmək, gözə xoş gələn şəklə salınmaq. *Otaqların divarları zərif naxışlı xalçalarla bəzənmişdi.* İ.Şıxlı. // Məc. mənada. *Mövsimi-gül gəldi və gülşən bəzəndi bəzm üçün.* Xətayi. *Təbiət bəzənir hünərimizdən; Axan şəlalələr bizə əl çalır!* S.Vurğun.

**BƏZƏNMİŞ** *f.sif.* 1. Bəzək vurulmuş, zinətləndirilmiş, bəzədilmiş. *Bəzənmiş səhnə. – Bahadır Yusiflə bir böyük gözəl bəzənmiş zalda bulundular. Bunlar bir-biri ilə şirin söhbətə məşğul idilər.* N.Nərimanov.

2. Özünə bəzək vurmuş, qəşəng geyinmiş.

**BƏZƏRƏK** *is. bot.* Kətan toxumu.

**BƏZƏTDİRMƏ** "Bəzətdirmək"dən *f.is.*

**BƏZƏTDİRMƏK** *icb.* Bəzək vurdurmaq.

**BƏZƏTMƏ** "Bəzətmək"dən *f.is.*

**BƏZƏTMƏK** b a x **bəzəndirmək**.

**BƏZGƏK** *is. zool.* Dovdaqlar fəsiləsinə mənsub, çöldə yaşayan köçəri quş. *Ayın əksi suya düşüb parlar; Uçuşur göy üzündə bəzgəklər.* A.Səhhət.

**BƏZİ** *əvəz.* [*ər.*] Hamısı yox, parası, ayrı-ayrı. *Bəzi adamlar. Bəzi rayonlar. – O, nəinki özünü, hətta bəzi uzaq qohumlarını da saxlayırdı.* İ.Şıxlı. // İs. mənasında. *Bəzilərinə bu xoş gəlir. Bəzilərinin bu işdən xəbəri yoxdur.*

**BƏZİR** b a x **bəzərək.**

**BƏZİRGAN** b a x **bazirgan.**

**BƏZİSİ** b a x **bəzi**.

**BƏZL** [*ər.*]: **bəzl etmək** *köhn.* – bağışlamaq, əsirgəməyib vermək. *Vətən uğrunda, millət eşqində; Bəzli-can et xülusi-niyyət ilə.* M.Ə.Sabir.

**BƏZM** *is.* [*fars.*] *tənt.* Kef məclisi, qonaqlıq. *Gülzarlar oldu işrətabad; Hər yerdə olundu bəzmə bünyad.* Füzuli. *Gətir saqi, meyi-gülgün, bu bəzmi bir bahar eylə.* Nəbati. *..Alimlər məclisində, dostlar bəzmində oldum.* Ə.Cəmil.

**BƏZMGAH** *is.* [*fars.*] *tənt.* Eyş-işrət məclisi, kef məclisi (yeri).

**BƏZR** *is.* [*ər.*] 1. Toxum əkiləcək dən.

2. Kətan toxumu. // Kətan toxumu yağı.

**BƏZZAZ** *is.* [*ər.*] *köhn.* Parça, arşınmalı satan tacir. *Bəzzaz malı* (parça, arşınmalı). *Bəzzaz dükanı. – İki il bundan qabaq bu adam bəzzaz Hacı Əlinin dükanından iki top çit oğurlamışdı.* C.Məmmədquluzadə. *Sıra ilə düzülmüş bəzzaz və əttar dükanlarının qabağında ərizə yazan mirzələr işsizlikdən mürgüləyirdi.* S.Rəhman.

**BƏZZAZİYYƏ** *is.* [*ər.*] *köhn.* 1. Bəzzaz malı, parça, arşınmalı.

2. Bəzzaz dükanı, parça, arşınmalı mağazası. [Rüstəm:] *Sən mənim məsləhətimə bax: bu dükanı bağla, bir ayrı bəzzaziyyə mağazası aç.* Ə.Haqverdiyev.

**BƏZZAZLIQ** *is. köhn.* Bəzzazın peşəsi, sənəti; arşınmalçılıq. [Rəşid:] *Bəlkə gedim dükan açım, bəzzazlıq eləyim.* M.Hüseyn.

**BIÇAQ** *is.* 1. Kəsmək üçün alət. *Bağban bıçağı. Ət bıçağı. Cib bıçağı.*

2. Müxtəlif alətlərin, mexanizmlərin və s.-nin kəsən hissəsi.

◊ **Bıçaq sümüyə dayanmaq** – son həddə çatmaq, əlacı kəsilmək, lap cana gəlmək. *Sümüyə lap bu gün dayandı bıçaq; Durmayır qeyzdən başımda papaq.* S.Ə.Şirvani. [Varlılara müraciət edənlərin] *əli hər yerdən üzülərdi, bıçaq sümüyə dayanardı.* H.Sarabski.

**BIÇAQÇI** *is.* 1. Bıçaq qayıran usta. *Bakıda, ümumiyyətlə, peşəkarlar: bənna, xarrat, dəmirçi, bıçaqçı və sairə çox olardı.* H.Sarabski.

2. Bıçaq və s. itiləyən adam.

**BIÇAQÇILIQ** *is*. Bıçaq qayırma sənəti.

**BIÇAQLAMA** "Bıçaqlamaq"dan *f.is.*

**BIÇAQLAMAQ** *f.* Bıçaqla yaralamaq, bıçaqla vurmaq. *Axırda yoldaşlarından birini bıçaqlayıb yaralamağının üstündə Əmiraslanı məktəbdən xaric etdilər.* S.S.Axundov.

**BIÇAQLANMA** "Bıçaqlanmaq"dan *f.is.*

**BIÇAQLANMAQ** *məch*. Bıçaqla yaralanmaq, bıçaqla vurulmaq.

**BIÇAQLAŞMA** "Bıçaqlaşmaq"dan *f.is.*

**BIÇAQLAŞMAQ** *qarş.* Dalaşaraq birbirini bıçaqla vurmaq.

**BIÇAQLI** *sif.* Bıçağı olan, kəsici hissəsi olan. *Bıçaqlı alətlər.*

**BIÇQI** *is.* Mişar.

**BIÇQIÇI** *is.* Bıçqı ilə ağac və s. kəsən (adam); mişarçı.

**BIÇQILAMA** "Bıçqılamaq"dan *f.is.*

**BIÇQILAMAQ** *f.* Bıçqı ilə kəsmək, mişarlamaq.

**BIÇQILANMA** "Bıçqılanmaq"dan *f.is.*

**BIÇQILANMAQ** *f.* Bıçqı (mişar) ilə kəsilmək, mişarlanmaq.

**BIĞ** *is.* 1. Kişilərin üst dodaqlarının üstündə qırxılmamış saxlanan tük topası. *Gələn oğlanın nazik, qara bığları .. geriyə daranmış uzun saçlarına qısılmış balaca qulaqları vardı.* M.Hüseyn. *Cuma əsgərlərdən birinin sallaq bığlarını görürdü.* Ə.Əbülhəsən.

2. Heyvanların üst dodaqlarının hər iki tərəfindən çıxan uzun sərt tüklər. *Pişik bığları. Pələng bığları.*

◊ **Bığ(ının) yeri (yenicə) tərləmək** – həddibüluğa çatmaq. *Bığ yeri yeni tərləyən bu gənc* [Qasım ağa] *naxışlı corabları ilə xalının üzəri ilə səssiz yüyürərək atasına yanaşdı.* Çəmənzəminli. *Bığının yeri yenicə tərləyən*

*Kərim, ilk vaxtlardan hər cür ağırlığa dözməyə və qayğı çəkməyə başlamışdı.* S.Rəhimov. **Bığını burmaq** *məc.* – lovğalanmaq, özünə güvənmək, təşəxxüs satmaq. **Bığının altından gülmək** – istehza etmək, ələ salmaq. **Bığının altından keçmək** – rüşvət vermək. *Uzun-uzadı danışıqdan sonra başa düşdük ki, gərək .. Qəninin bığının altından keçək.* H.Sarabski.

**BIĞCIQ** *is.* 1. *zool.* Cücülərdə başın ön tərəfindən irəliyə doğru uzanan buğumlu və çox zaman tükə oxşayan hiss orqanı.

2. *bot.* Bitkilərin yarpaqlarında və saplaqlarında sapşəkilli törəmələr.

**BIĞIBƏY** *is. dan. zar.* İri və səliqəli bığları olan adam. [Çayçı] *..uzaqlaşmaq istəyəndə Veys "dayan-dayan!" deyib, əyilərək podnosun boşalmış yerinə işarə edib soruşdu: – Oradakı bığıbəy kimdir?* Ə.Əbülhəsən.

**BIĞIBURMA** *sif.* Gənc, yetişmiş, yekə, boylu-buxunlu. [Ağa Mərdan:] *Bəs o yaxşıdır ki, baldızın tamam dövləti aparıb bir bığıburma oğlana yedirə!* M.F.Axundzadə. *Qapıda bizdən başqa dörd-beş çoban da xidmət edirdi, hamısı yeniyetmə, bığıburma oğlanlar idi.* A.Şaiq.

**BIĞIQIRXIQ** *is.* və *sif. dan.* 1. Bığlarını qırxdırmış.

2. Keçmişdə mövhumatçıların və mürtəcelərin artistlərə verdiyi təhqirli ad. *Hüseyn dərin bir ah çəkib həzin səslə dedi: " ..Bilirsinizmi, mirzə, mənim əqrəbam mənə nə cəfalar edirlər?" Onların nəzərində aktyorluq sənəti baisi-xiclət bir peşə hesab olmağa görə, mənə "bığıqırxıq" ad qoyub, mənimlə ədavət edirlər".* S.M.Qənizadə.

**BIĞLANMA** "Bığlanmaq"dan *f.is.*

**BIĞLANMAQ** *f.* Bığı çıxmaq.

**BIĞLI** *sif.* Bığları olan. *Bığlı kişi.*

**BIĞLICA** *is. bot.* Taxıllar qrupuna mənsub birillik ot bitki.

**BIĞLI-SAQQALLI** *sif.* Bığ və saqqal qoymuş; yaşlı, yekə. *İndi Nəcmi də bu bığlı-saqqallı kursantları yaxşıca təsəvvür edirdi.* Ə.Əbülhəsən.

**BIĞSIZ** *sif.* Bığı olmayan. Bığı çıxmamış kişi.

**BIĞYAĞI** *is. dan.* 1. Keçmişdə bığı yağlamaq üçün xüsusi yağlı maddə.

2. *dan. zar.* Cüzi rüşvət. *Bığyağı vermək. – Kəndlilər əvvəlcə Əbdüləzəlin qapısında dayanıb, onunla haqq-hesab etməli idilər. Yəni ona "bığyağı" verməli idilər.* H.Sarabski.

**BIQDIRICI** *sif.* Bezikdirici, usandırıcı, cansıxıcı, təngə gətirən. *İlk həyatın yeni həyatverici günəşi, özünün ılıq və munis şüasını ətrafa saçmaqla, qışın bıqdırıcı və soyuq havasına qələbə çalmaqda idi.* S.Hüseyn.

**BIQDIRICILIQ** *is.* Bıqdırıcı şeyin halı; usandırıcılıq.

**BIQDIRMA** "Bıqdırmaq"dan *f.is.*

**BIQDIRMAQ** *f.* Bezikdirmək, usandırmaq, təngə gətirmək. [Tamara:] *Siz romanlarla danışırsınız. Məni də roman bıqdırıbdır.* S.Rəhimov.

**BIQMA** "Bıqmaq"dan *f.is.*

**BIQMAQ** *f.* Bezikmək, usanmaq, təngə gəlmək. *Daş yonmaqdan artıq bıqmışdım, başqa işə girmək istəyirdim.* H.Sarabski.

**BILİNA** *is.* [*rus.*] Rus xalq ədəbiyyatında folklor janrı, dastan.

**BITRAQ** *is. bot.* Çox sıx bitən alaq, bitki. *Bu il fındıqlar bıtraq kimi bir məhsul gətirmişdi.* S.Rəhimov.

**BITRAQLIQ** *is.* Çoxlu bıtraq bitmiş yer.

**BIY** *nida.* Təəccüb, heyrət, narazılıq, təəssüf bildirir (bəzən təkrar şəklində işlənir). [Şahbaz bəy:] *Bıy, Şərəfnisə, necə uşaq-uşaq danışırsan?* M.F.Axundzadə. [Kişi:] *Bıy, buna bax ey, niyə tanımırsan? Mən sənin həmşəhərlinəm də!* C.Məmmədquluzadə.

**bi**... [*fars.*] İsimlərin əvvəlinə gətirildikdə inkar və yoxluq mənasında sifət düzəldən və -siz/-süz mənasını verən şəkilçidir, məs.: biədəb, biinsaf, bivəfa və s.

**BİABIR** *sif.* [*fars.*] Abırsız. ☐ **Biabır etmək (eləmək, eyləmək)** – abırdan salmaq, rüsvay etmək, adını ləkələmək. [Kərim:] [Süleyman bəy] *mənim bacımı biabır eləyib, mən də onun qarnını balıq qarnı kimi cırıb, bağırsaqlarını ayağına dolamasam, atamın oğlu deyiləm.* Ə.Haqverdiyev. [Barat:] *Yoldaş Şərif, nə haqq ilə sən müəllimə Almas xanımı biabır edirsən?* C.Cabbarlı. [Tahir:] *Qoy, nə deyir desin, məni biabır da eləsə, ürəyimdəkiləri açıb ona söyləyəcəyəm.* M.Hüseyn. **Biabır olmaq** – rüsvay olmaq, ad batırmaq, abırı tökülmək. *Camaat qabağında biabır olmaq.* – [Hacı İslam:] *Bu dəli-*

*nin öhdəsindən bəlkə sən gələsən, yoxsa vallahi biabır olduq.* C.Məmmədquluzadə. [Balaş:] *Çul-çuxası ilə həyətə-zada çıxar, biabır olarıq.* C.Cabbarlı. [Mir Mahmud:] *Ay Hüseyn, bu nə paltardır əyninə geymisən, çıxart, çıxart, dayın bizə gəlir, biabır olarıq.* S.Rəhman.

**BİABIRCASINA** *zərf* 1. Abırsızca, utanmaz bir surətdə. *Biabırcasına danışmaq.*

2. Çox pis, utanılacaq bir surətdə, rüsvayçılığa səbəb olacaq bir tərzdə. *Biabırcasına geridə qalmaq.*

**BİABIRÇI** *sif.* Rüsvayedici, eyib gətirən, adbatıran, utanılacaq. *Biabırçı hərəkət.* – *Evdə qulaqtutan, biabırçı bir marçıltı qopdu.* Mir Cəlal.

**BİABIRÇILIQ** *is.* Rüsvayçılıq, rəzalət, utanılacaq hal. *Bu nə biabırçılıqdır?* – [Nazlı xanım:] *İndi, Nəcəf bəy, sən də bizim biabırçılığımıza razı olma!* Ə.Haqverdiyev. *Sübhanverdizadə Kosanın burnunu görərək, əli ilə onu içəriyə çağırdı: – Harada itmisən? Katib nə biabırçılıq eləyib, .. nə qayırıb?* S.Rəhimov.

**BİAHƏNG** [*fars.*] b a x **ahəngsiz**. *Gahi bir nəğmə kimi biahəng; Gahi bir lövhə kimi rəngarəng.* A.Səhhət.

**BİAR** [*fars.* bi... və *ər.* ar] b a x **arsız**. *Biar adam.* – *Daşə çəkmiş xalq üçün Fərhad Şirin surətin; Ərz qılmış xalqa məhbubun, əcəb biar imiş!* Füzuli. *Gözəl olan gərək biar olmasın.* Q.Zakir. *Aslan .. Həsənin biar qumarbazın biri olduğunu deyərək, Sitarəyə nəsihət edirdi.* C.Cabbarlı.

**BİARAM** [*fars.*] b a x **aramsız**. *Keçdi üç ay, hələ ondan nə kağız var, nə pəyam; Gözləyir ailəsi kənddə onu biaram.* A.Şaiq.

**BİARLIQ** b a x **arsızlıq**.

**BİATLON** *is.* [*yun.*] *idm.* 20 km məsafədə tüfəngdən atəş açmaqla icra edilən xizək yarışı.

**BİBAK** *sif.* [*fars.*] Qorxusuz, qorxmaz, heç bir şeydən ehtiyat etməyən. *Nisbətim vermə Məcnunə; Bir aşiqi-bibakəm mən.* Q.Zakir. *Gün batmışdı, Hacı qayət xişmnak; Qayalardan aşıb gedirdi bibak.* A.Səhhət.

**BİBƏHRƏ** [*fars.*] b a x **bəhrəsiz.** [Məşədi Oruc:] *..Bəlkə ağanın fəzilətinin kəraməti və mərhəmətindən mənim həmşəhərlilərim bibəhrə qalmasınlar.* C.Məmmədquluzadə. *Bilmirəm mən nə yazım, bəlkə bəyənsin bu müdir; Nə ki zəhmət çəkirəm bibəhrə gedir.* C.Cabbarlı.

**BİBƏR** *is.* Dadı acı, uzunsov tərəvəz bitkisi; istiot. *Göy bibər. Qırmızı bibər.*

**BİBƏRLİ** *sif.* İçində bibər olan, bibər qatılmış; istiotlu.

**BİBİ** *is.* Övlad üçün atanın bacısı.

**BİBİGƏLİNİ** *is.* Atanın bacısının gəlini (oğlunun arvadı).

**BİBİQIZI** *is.* Atanın bacısı qızı.

**BİBİNƏVƏSİ** *is.* Atanın bacısının nəvəsi.

**BİBİOĞLU** *is.* Atanın bacısının oğlu.

**BİBİYOLU** *is. etnoqr.* Gəlinə toy parçası göndərildikdə, oğlan tərəfindən bibiyə hədiyyə edilən paltarlıq parça.

**BİBLİÓQRAF** [*yun.*] (kitabiyyat) mütəxəssisi.

**BİBLİOQRAFÍK** *sif.* Biblioqrafiyaya (kitabiyyata) aid olan. *Biblioqrafik məlumat.*

**BİBLİOQRÁFİYA** *is.* [*yun.*] 1. Müəyyən məsələyə dair kitab, məcmuə və məqalələrin siyahısı; kitabiyyat; kitabların məzmununun elmi təsviri və onların siyahı və qeydlərinin tərtibi.

2. Dövri mətbuatda (məcmuə və qəzetlərdə) yeni çıxmış kitablar və s. haqqında tənqidi məlumat verilən şöbə. *Qəzetin tənqid və biblioqrafiya şöbəsi.*

**BİBLİYA** b a x **İncil.**

**BİC**[1] *sif.* və *is.* 1. *dan.* Rəsmi nikah olmadan doğulan uşaq.

2. Çox hiyləgər, fəndgir. *Bic adam.* // Çoxbilmiş, tədbirli, zirək, ağıllı mənasında. *..Bildi ki, oğlu necə bic və haramzadədir...* M.F.Axundzadə. // Bəzən söyüş kimi işlənir. *Bic-vələdüznalara söz batmayır; Min də nağıl aç, birin aldatmayır.* M.Ə.Sabir.

3. *məc.* Çoxbilmiş, hər şeydən başçıxaran, zirək

**bic-bic** *zərf Zeynal isə bic-bic hamının ağzına baxdıqdan sonra qeyd etdi..* Ə.Əbülhəsən.

**BİC**[2] *is. dan.* Ağac və kolların kötüyündən, yaxud gövdəsinin alt hissəsindən çıxan xırda zoğ, haramı.

**BİCA** *sif.* və *zərf* [*fars.*] 1. Yersiz, münasibətsiz, mənasız. *Bica söz. Bica danışıq.* – [Müəllim:] *Amma uşaq tayfasına o cür sözləri deməyiniz, bir az bicadır.* C.Məmməd-

quluzadə. *Anladım mətləbini, etmə məzəmmət bica.* A.Səhhət.

2. Bihudə, əbəs, boş-boşuna, nahaq (çox vaxt "bica yerə" şəklində işlənir). *Bica əlləşmə. – Düşmə bica yerə sən bu təmaixamə, könül.* S.Ə.Şirvani. *Bica yerə hər ləhzdə min şurü şərin var; Çox pis nəzərin var.* M.Ə.Sabir. [Movlamverdi:] *Ay bacılar, ay qardaşlar, axır sizin ağlamağınız bicadır.* C.Məmmədquluzadə. [Sara:] *Atam üçün qüssə edəcəyimdən qorxursansa, o da bicadır.* C.Cabbarlı.

**bica-bica** *zərf* b a x **bica** 2-ci mənada. *Həzrət saqqalını bica-bica saxlamayırdı.* Ə.Əbülhəsən.

**BİCƏK** *is. məh.* 1. B a x **bic**$^{2}$.

2. Noxud.

3. Daha kiçik yaşda ikən doğan düyə, erkən doğan düyə.

**BİCƏNGƏ(NƏ)** *sif. məh.* Hiyləbaz, bic. [Dayıoğlu:] *Amma elə ki, bicəngə xalaoğlum başladı dayımı yamsılamağa və dayım kimi dodaqlarını tərpətməyə, .. burada, doğrusu, mən də gülməyə başladım.* C.Məmmədquluzadə.

**BİC-QIC** b a x **bic**$^{2}$**.**

**BİCLƏŞMƏ** "Bicləşmək"dən *f.is.*

**BİCLƏŞMƏK** *f. dan.* Getdikcə ustalaşmaq, hiyləgərləşmək; kələkbaz (diribaş, tədbirli) olmaq. *O, yaman bicləşibdir, aldatmaq olmur.*

**BİCLİK** *is.* Hiylə, kələk, fənd, fırıldaq; hiyləgərlik, kələkbazlıq, fəndgirlik. *Biclik etmək. – Hər fənd və bicliklə edər kəsb maaşın; Saxlar özü başın.* M.Ə.Sabir. *Çərçizadə nə qədər bicliyi, bacarığı, istedadı vardı, ortaya çıxardı.* Ə.Vəliyev. ◻ **Özünü bicliyə qoymaq (vurmaq)** – hiylə işlətmək. *"Molla Nəsrəddin" və "Tərcüman"ları köməyə çağıranda, onlar da özlərini qoyurlar bicliyə.* C.Məmmədquluzadə.

**BİÇARƏ** *sif.* [*fars.*] 1. Yazıq, miskin, fağır, məzlum; bədbəxt. *Biçarə münəccimbaşının ərvahı uçub, başladı yarpaq kimi titrəməyə.* M.F.Axundzadə. *Bu soyuq, tozlu gecədə biçarə Məşədi Əsgər adlı bir kişi balaları üçün ruzi axtarırdı.* S.M.Qənizadə. *..Biçarə qızın zahiri çirkinliyi bir yanda dursun, toy edib ərə getmək üçün azacıq bir cehizi də yox idi.* B.Talıblı..

2. Çarəsiz, əlacsız; aciz. *Axır biçarə ananız sizə deyirdi: – Bala, ağlama, xortdan gələr, səni aparar.* C.Məmmədquluzadə. [Əşrəf bəy:] *Biçarə müsəlmanın hər bir işi daş arasından çıxır.* N.Vəzirov. *Cahillər isə biçarə Bəşiri xəncərlə öldürüb qaçırlar.* S.S.Axundov. // İs. mənasında. [Səkinə xanım:] *Biçarə iki il sərasər mərhum qardaşıma yalvardı ki, məni ona versin.* M.F.Axundzadə. *Sən iki biçarəni bir zəxmlə qıldın həlak.* S.Ə.Şirvani.

**BİÇARƏLİK** *is.* Çıxılmaz vəziyyət, köməksizlik, acizlik. *..Biz burada məmləkəti aclıq, biçarəlik və acizliyə aparan əcnəbi kapitalının törətdiyi faciələri faş etməliyik.* M.İbrahimov.

**BİÇDİRİLMƏ** "Biçdirilmək"dən *f.is.*

**BİÇDİRİLMƏK** "Biçdirmək"dən *məch*.

**BİÇDİRMƏ** "Biçdirmək"dən *f.is.*

**BİÇDİRMƏK** "Biçmək"dən (1 və 3-cü mənalarda) *icb*. *Taxılı biçdirmək.* – [Hacı Nuru:] *Sən mülkədarsan, sənə lazım idi ki, əkdirəydin, biçdirəydin, dövlət qazanaydın.* M.F.Axundzadə.

**BİÇƏNƏCƏK** b a x **biçənək.** *İlxı dağdan, düzdən keçib gəldi, ballıcalı Qara xanın biçənəcəyinə doldu.* "Koroğlu".

**BİÇƏNƏK** *is.* Biçiləcək yer, otlaq, çəmənlik. *Nəbi biçənəyin içində oturub, atını otarırdı.* "Qaçaq Nəbi". *Taxıl zəmiləri arasındakı biçənəklər yenicə toxunmuş əlvan xalılar kimi yerə sərilmişdi.* M.Hüseyn. *Daşlıq yolun kənarında ot-ələf elə ucalmışdı ki, deyərdin buralar xüsusi biçənək yeridir.* Mir Cəlal.

**BİÇİCİ** *xüs.* 1. *is.* Paltar və s. biçən usta (dərzi).

2. *sif.* Paltar biçməklə məşğul olan. [Tikiş fabrikinin] *biçici sexində iki pres qoyulmuşdur.* (Qəzetlərdən).

**BİÇİLMƏ** "Biçilmək"dən *f.is.*

**BİÇİLMƏK** "Biçmək"dən *məch*. *Paltar biçilmişdir.*

**BİÇİLMİŞ** "Biçilmək"dən *f.sif.* *Biçilmiş paltar. Biçilmiş taxıl. Əsən asta külək biçilmiş otların qoxusunu kəndə doldurdu.* İ.Şıxlı.

**BİÇİM** *is.* 1. Biçilmək tərzi; paltarın forması, fasonu, ülgüsü. *Bu biçimdə paltar görməmişəm. Onun paltosunun biçimi çox gözəldir.* – [Kor kişinin] *əlbəsəsinin tərzi, biçimi avamlığını .. andırırdı.* S.Hüseyn. // Şəkil,

qayda, üsul, forma. *Qəhrəman kağızı əlində müxtəlif biçimdə qatlayaraq, o tərəf-bu tərəfini hamarladı.* Ə.Vəliyev.

2. Ölçü, böyüklük. *Küçələrdəki iki cərgə söyüd ağacları bir biçim və bir ölçüdə idi.* M.S.Ordubadi. *Mən bütün uşaqlara bir biçimdə .. olan konserv qutularına yanaşan kimi yanaşmamışam.* Mir Cəlal.

3. Bədən, boy-buxun, qədd-qamət mənasında. *İnsanın biçimi.* – [Bədircahan:] *Züleyxa xanım təəccüb edir, sizin məlahətinizə, şücaətinizə, .. deyir, bu biçimdə mən ömrümdə adam görməmişəm.* N.Vəzirov.

**BİÇİMLİ** *sif.* Biçimi düzgün, quruluşu düzgün; tənasüblü, yaraşıqlı, qəşəng, sərrast, təndürüst. *Biçimli adam.* – [Mahrunun] *nazik və biçimli dodaqları iyul günəşindən solan qızılgülün yarpağı qədər küskün idi.* M.S.Ordubadi.

**BİÇİMSİZ** *sif.* 1. Bədən quruluşu, görünüşü pis; bədəni qeyri-mütənasib, eybəcər, yöndəmsiz. *Biçimsiz adam. Biçimsiz bədən.* – *Qısaboylu, biçimsiz bir adam sol ayağını çəkə-çəkə içəri girdi.* A.Şaiq.

2. Pis biçilmiş, pis tikilmiş, yaraşıqsız, səliqəsiz, tənasübsüz. *Biçimsiz paltar.* – *Şəkildə görünən zatın .. əynindəki gen və biçimsiz şalvar, onun ayağındakı qıvraq çarıq qızın diqqətini özünə cəlb etmişdi.* M.S.Ordubadi.

3. Ümumiyyətlə, pis, çirkin, kobud mənasında. [Jenya:] *Biçimsiz və tez-tez dəyişib, başqa rəng alan düşüncələr səni tez-tez o tərəf-bu tərəfə çırparaq yormaqdadır.* M.S.Ordubadi. *Vaxtı ilə musiqidə formalizm tərəfdarları da melodiyanı nizamsız və biçimsiz kobud səslər yığını ilə əvəz etmişdilər.* Ə.Bədəlbəyli.

**BİÇİMSİZLƏŞDİRİLMƏK** *məch.* Biçimsiz, yaraşıqsız hala salınmaq; çirkinləşdirilmək.

**BİÇİMSİZLƏŞDİRMƏ** "Biçimsizləşdirmək"dən *f.is.*

**BİÇİMSİZLƏŞDİRMƏK** *f.* Biçimsiz, yaraşıqsız hala salmaq, çirkinləşdirmək.

**BİÇİMSİZLİK** *is.* Biçimsiz şeyin halı, çirkinlik, yaraşıqsızlıq, tənasübsüzlük, səliqəsizlik.

**BİÇİN** *is.* Otu, taxılı oraqla, maşınla və s. ilə biçmək işi. *Biçin vaxtı. Biçin maşını. Kolxozçular biçinə hazırlaşırlar.* – *Biçinə çin gərəkdir, xırmana vəl.* S.Ə.Şirvani. *Biçin vaxtı yetişdi.* [Nadir] *taxılını hamıdan qabaq biçdi, döydü, təmizlədi.* B.Talıblı.

**BİÇİNÇİ** *is.* Biçin işi ilə məşğul olan adam, ot, ya taxıl biçən adam. *Əlində dəryaz ot biçər mayıs ayı biçinçilər.* A.Səhhət. *Sütül sünbüllər ağır başlarını əyib, sanki biçinçini gözləyirlər.* Mir Cəlal. *Sahibkarlarla biçinçilər arasında sövdələşmə başlanardı.* İ.Şıxlı.

**BİÇİNÇİLİK** *is.* Biçinçinin işi, sənəti, peşəsi. [Kəndli:] *Sizin şərbaflar da biçinçilik bilsəydilər, nə yaxşı olardı...* Ə.Əbülhəsən.

**BİÇİZ** *sif.* [*fars.*] Yoxsul, kasıb, fağır, heç bir şeyi olmayan. *Sonra* [şah] *üzün hərəmlərə tutub xitab elədi: – Mən əfradi-nasdən bir fağır və biçiz kimsənəyəm.* M.F.Axundzadə.

**BİÇİZLİK** *is.* Yoxsulluq, kasıblıq, fağırlıq.

**BİÇMƏ** "Biçmək"dən *f.is.*

**BİÇMƏK** *f.* 1. Taxılı, otu oraq, dəryaz, maşın və s. ilə kəsmək. *Taxılı biçmək. Otu biçmək. Tarlanı biçmək.* – *Biz məgər bilmirik taxıl biçmək.* S.Ə.Şirvani. // *məc.* Götürmək, əldə etmək mənasında. *Nə əkərsən, onu biçərsən.* (Məsəl). *Çün hər nə kim əkərsən, anı biçərsən, axır.* Nəsimi.

2. Parçadan boya, bədənə görə paltar və s. kəsmək. *Şalvar biçmək. Palto biçmək.* // Ümumiyyətlə, kəsmək. *Sıxır bədənimi bu kor fələyin; Əynimə biçdiyi don aşkar-aşkar.* B.Vahabzadə.

3. *məc.* Qırxmaq. *Sübhanverdizadə üzünü kəsə-kəsə, dəryazla ot biçən kimi, tüklərini bir növ ala-yarımçıq biçib qurtardı.* S.Rəhimov.

4. *məc.* Kütləvi surətdə qırmaq, öldürmək, məhv etmək (bəzən "biçib-tökmək" şəklində işlənir). [Həmzət:] *İldırımmisal qılıncı ilə düşmənləri biçib-tökür.* M.Hüseyn.

5. Bəzi sözlərə qoşularaq, ifadələr düzəldilir; məs.: boğazını biçmək, divan biçmək və s.

**BİDAD** [*fars.*] 1. Zülm, əzab, əziyyət. ☐ **Bidad etmək (eləmək)** – zülm etmək. *Xublar kim bu qədər könlümə bidad eylər; Bir usanmaz çəkə əl, dil dögümüş, ahən imiş.* S.Ə.Şirvani. *Onu rahat öldürmüşdür Bəypolad; Sinəmə dağ çəkmiş, eyləmiş bidad.* A.Səhhət. ..[Ağabala] *danışırdı ki, qolçomaq tayfası kənddə bidad eləyir.* S.Rəhimov. **Dad-bidad** – b a x **dad.**

2. *məc.* Amansız, rəhmsiz. *Cismi-zarım tiği-bidadından oldu çak-çak.* Füzuli.

**BİDAMAQ** *sif.* və *zərf* [*fars.* bi... və *ər.* dimaq] Kefsiz, naçar; kefi, əhvalı pozğun. *Eybdir bir-birini həcv edə ərbabi-kəmal; Bidamaq olma sözümdən, sənə qurban, Yusif!* S.Ə.Şirvani. *Yolu bir xeyli zaman bidamaq getdim.* C.Məmmədquluzadə.

**BİDANƏ** *sif.* [*fars.*] Tumsuz, toxumsuz, dənsiz. *Bidanə üzüm. Bidanə kişmiş.*

**BİDAR** *sif.* [*fars.*] *klas.* 1. *köhn. şair.* Oyaq, ayılmış (*yuxudan*), yuxusuz. *Eyləyibsən məni eşqə giriftar; Gündüzüm biqərar, gecələr bidar.* M.P.Vaqif. ☐ **Bidar etmək (qılmaq)** – ayıltmaq, oyatmaq. *Əcəl xabından, əfqanlar çəkib, Məcnunu bidar et!* Füzuli. *Səba, gəl seyri-gülzar et! Gülü reyhanı bidar et!* M.V.Vidadi. *Bidar edin amandır o zülfi-siyahımı; Zülm ilə etməsin günümü tar, yatmasın.* S.Ə.Şirvani. *Amma and verirəm səni o körpə uşaqların canına, yorğanı çək başına yat, dəxi məni şirin yuxudan bidar etmə!..* C.Məmmədquluzadə. **Bidar olmaq** – oyaq olmaq, oyaq qalmaq, yatmamaq. *Kəvakib seyrini şəb ta səhər bidar olandan sor.* Füzuli. // Ayılmaq, oyanmaq. *Seyyidi zar görüb vəslini bidar olmuş.* S.Ə.Şirvani. *Hər kəs oxuyub elmlə bidar olacaqdır.* M.Ə.Sabir. *Çöllər yuxudan olunca bidar; Min rəng çiçəklə doldu gülzar.* A.Şaiq.

**BİDAYƏT** *is.* [*ər.*] *köhn.* Əvvəl, başlanğıc, ibtida. *Yəni necə ki, məkanın bidayət və nihayəti yoxdur, zaman dəxi biibtida və intihadır.* M.F.Axundzadə.

**BİDEH** *is.* [*fars.*] *köhn.* Vergi. [Fərhad:] *Rəiyyət borcludur .. qazandığının yarısını bidehə verə, qalanını da mənə.* Ə.Haqverdiyev.

**BİDƏLİL** *sif.* [*fars.* bi... və *ər.* dəlil] b a x **dəlilsiz.**

**BİDƏMAQ** b a x **bidamaq.** *Səni görcək özün soxar içəri; Tünd olub, qapını bidəmaq çəkər.* Q.Zakir.

**BİDƏRD** [*fars.*] 1. B a x **dərdsiz.** *Böylə kim ol dilrüba bidərddir, mən dərdmənd.* Füzuli. *Gər rəfiqin ola bidərd, davasız dərddir; Əhli-dildən gələ, min zəxm o bir dərd olmaz.* M.V.Vidadi. *Çün sübh çayın içdi kişi, çıxdı kənarə; Bidərdü qəm oldun.* M.Ə.Sabir.

2. İs. mənasında. *Bidərdlərdə dərd görüb çarə eylədim.* S.Ə.Şirvani.

**BİDƏRMAN** [*fars.*] b a x **bidəva.** *Birdən sual edən dərdi-bidərman; Əhvalını pərişanə yetirrəm.* Aşıq Pəri.

**BİDƏT** *is.* [*ər.*] Hamı tərəfindən qədimdən bəri qəbul edilmiş qayda və adətə, yaxud dinə zidd olan şey, keyfiyyət. *Aləmə adət oldu, sənə bidət.* (Ata. sözü). *Döndərib "a-ba"yə "əlif-bey"ləri; Bidətə bax! "ya" oxudur "yey"ləri.* M.Ə.Sabir. *Təriqətlər və bidətlərin İrandan, İraqdan və Orta Asiyadan Azərbaycana gətirildiyi şübhəsizdir.* M.S.Ordubadi.

**BİDƏVA** *sif.* [*fars.* bi... və *ər.* dəva] Davasız, dərmansız, əlacsız, sağalmaz.

**BİDİN** [*fars.* bi... və *ər.* din] b a x **dinsiz.** [Ağa Mərdan:] *Bəli, indi məlum oldu ki, siz niyə belə danışırsınız, çünki o .. bidinin ağzı sizə dəyibdir.* M.F.Axundzadə. *İndi adamlar deyəsən cindilər; Cin nədi, şeytan kimi bidindilər.* M.Ə.Sabir.

**BİDİNLİK** *is.* Dinsizlik, heç bir dinə inanmama.

**BİDMİŞK** [*fars.*] b a x **bədmüşk**.

**BİELM** *sif.* [*fars.* bi... və *ər.* elm] Elmsiz, biliksiz.

**BİETİBAR** *sif.* [*fars.* bi... və *ər.* etibar] Etibarsız. *Bietibar adam.* – [Rüstəm bəy:] *Məhərrəm, sənin axırın niyə belə bietibar oldu?* N.Vəzirov. *Elmsiz şeir əsası yox divar kimi olur və əsassız divar qayətdə bietibar olur.* F.Köçərli.

**BİETİBARLIQ** *is.* Etibarsızlıq; etibara layiq olmama. *Qələmin belə aciz və bietibarlığını görəndə rəssamlara əl ataq!* C.Cabbarlı.

**BİETİNA** *zərf* [*fars.* bi.. və *ər.* etina] Etinasız. *Şah Abbası kənar qoyub, qırx il sərasər onun saffaklığına və cabbarlığına bietina nazir oldular?* M.F.Axundzadə.

**BİEYB** *sif.* [*fars.*] Eyibsiz, nöqsansız; qüsursuz.

**BİƏDƏB** [*fars.* bi... və *ər.* ədəb] b a x **ədəbsiz.** *Oldu vacib eyləmək ol biədəbdən ictinab.* Füzuli.

**BİƏDƏBLİK** *is.* Ədəbsizlik, tərbiyəsizlik, yaramazlıq; ədəbsiz, nalayiq, qaba hərəkət, söz. ☐ **Biədəblik etmək** – ədəbsiz (nalayiq) hərəkət etmək, ya söz söyləmək. *Bir biədəblik eyləmədik biz ki vaizə; Bizdən nə*

*sadir oldu ki, dəydi damağına?* S.Ə.Şirvani. *Elə ittifaq düşür ki, yolçuların bəzisi biədəblik edib üzə durur.* C.Məmmədquluzadə. [Rəşid:] *Bağışlayın, xanım, qulluğunuzda biədəblik elədim.* Ə.Haqverdiyev.

**BİƏQL** [*fars.* bi... və *ər.* əql] b a x **ağılsız.**

**BİƏLAC** [*fars.* bi... və *ər.* ilac] Əlacsız, çarəsiz, naçar. [Cahangir bəy:] *İndi o ümidlərim də kəsilib, qalmışam naçar, biəlac.* N.Vəzirov.

**BİƏLACLIQ** *is.* Əlacsızlıq, çarəsizlik.

**BİƏMƏL** *sif.* [*fars.* bi... və *ər.* əməl] Deyinə və ya deyilənə əməl etməyən; boşboğaz, bekara. ☐ **Alimi-biəməl** – b a x **alim.**

**BİƏNCAM** *sif.* [*fars.* bi... və *ər.* əncam] Sonsuz; aqibətsiz, nəticəsiz, faydasız.

**BİƏNDAZƏ** *sif.* [*fars.*] Əndazəsiz, ölçüsüz, biçimsiz; qaydasız.

**BİƏNDAZƏLİK** *is.* 1. Ölçüsüzlük, biçimsizlik; həddən artıqlıq.

2. Nizamsızlıq, qaydasızlıq, qanunsuzluq, başlı-başınalıq. *Ənva-ənva biəndazəlik və şərarət əmələ gətirdilər.* M.F.Axundzadə.

**BİƏSİL** *sif.* [*fars.* bi... və *ər.* əsil] Əsilsiz, əsli-nəcabəti olmayan, alçaq.

**BİFAİDƏ** [*fars.* bi... və *ər.* faidə] b a x **bifayda.** *Bihudə deyil bu karxanə; Bifaidə gərdişi-zəmanə.* Füzuli.

**BİFAYDA** *sif.* Faydasız. [Fərhad:] *Bifayda olmaqdan isə, ölüb bir dəfə qurtarmaq məsləhətdir.* Ə.Haqverdiyev.

**BİFƏR** *sif.* [*fars.*] Fərsiz, fərasətsiz, bacarıqsız, bikara.

**BİFŞTÉKS** [*ing.*] *aşp.* Mal ətindən hazırlanan qızartma. [Əhməd:] – *İstərsən mənə bifşteks gətir,* – *deyə Əşrəfə baxdı.* A.Şaiq.

**BİGAH** *sif.* [*fars.*] Vaxtsız, gec, axşamçağı.

**BİGANƏ** *sif.* [*fars.*] Yad, yabançı, özgə, tanış olmayan. *Biganə adam.* – *Bu tədbir ilə mülki-İran tayfeyi-biganənin hücumundan məhfuz qaldı.* M.F.Axundzadə. // İs. mənasında. *Derlər səni eşqə mübtəlasan; Biganələr ilə aşinasan.* Füzuli. *Nə baxırsan oğrun-oğrun; Mənə biganələr kimi.* Xəstə Qasım. *Biganələrlə çünki olub aşina o gül; Ey kaş, olmayaydım əzəldən mən aşina.* S.Ə.Şirvani. *Biganəsən, olmaz məni görmək sənə qismət!* A.Səhhət. // Zərf mənasında. *Bir zaman, doğrudan da, xəyali bir məhəbbətlə sevdiyi qızın iztirab və göz yaşlarına qarşı Səlimi biganə və laqeyd baxa bilməzdi.* M.İbrahimov. *Direktor burada heç bir səhv görmədiyindən, sədrin baxışlarını da çox biganə qarşıladı.* M.Hüseyn. *Odunçuoğlu məclisi görməyirmiş kimi, biganə bir halda qapı ağzında dayandı...* Ə.Məmmədxanlı.

**BİGANƏLƏNMƏK** *f.* Biganə olmaq, yad olmaq, yadlaşmaq. *Salıbdır meylini yarım kuyinə; Əqlü huşum məndən biganələnmiş.* M.V.Vidadi.

**BİGANƏLİK** *is.* Yadlıq, yabançılıq. *Şahım, nəzər et məni-gədayə; Biganəlik etmə aşinayə!* Füzuli. *Xalqla dövlət arasında ədavətin, biganəliyin əsil səbəbi ruhanilərdir.* M.F.Axundzadə. [Ulduz] *ürəkləri ilə dodaqları arasında daima bir ayrılıq, bir biganəlik olanların duyduqlarını yaşamaqdadır.* Ə.Məmmədxanlı.

**BİGAR** [*fars.*] b a x **biyar.**

**BİGƏRAN** *sif.* [*fars.*] *klas.* Sonsuz, intəhasız, hüdudsuz. *Zakir, usanmadın o qədər eşqdən ki, ta; Candan usandırdı sitəmi-bigəran məni.* Q.Zakir.

**BİGÜMAN** *zərf* [*fars.*] 1. Şübhəsiz, şəksiz, yəqin, doğru. *Ayılsa atam məstlikdən haman; Məni tapmağa hökm edər bigüman.* M.Ə.Sabir.

2. Birinci mənanın əksinə: şübhəli, yəqin olmayan, gümanı heç yerə getməyən. *Mən bu işdən bigümanam.*

**BİGÜNAH** [*fars.*] b a x **günahsız.** *Məbada məni öldürə bigünah; Gətirdim bu xəlvət məkanə pənah!* M.Ə.Sabir. [Güldəstə:] *Bisəbəb, bigünah bir uşağın anasını at bayıra, axır nainsaf işdir...* N.Vəzirov. *Əslində onun* [Nəcəfəlinin] *heç bir günahı yox idi, o elə büsbütün və bigünah getdi!..* S.Rəhimov.

**BİHAL** *zərf* və *sif.* [*fars.* bi... və *ər.* hal] 1. Halsız, taqətsiz, yorulmuş, əldən düşmüş; üzgün, zəif. *Bihal yıxılmaq.* – *Sübh vaxtında bir qoca çaqqal; Aclıq etmişdi çox onu bihal.* S.Ə.Şirvani. *Kərbəlayı Qulaməli, hacının bu sözlərini eşidəndə, uca sövtlə hönkürüb, bihal dizi üstə çökdü.* Ə.Haqverdiyev. *Əjdər bihal uzanmalı oldu..* S.Rəhman.

2. Özündən getmiş, ürəyi keçmiş, bayğın. ☐ **Bihal olmaq** – özündən getmək, bayılmaq. [Kəblə Fatma:] *Nazlını bir fənd ilə*

*dilə tutdum, amma, vallah, o qədər ağlayıb ki, az qalıb ki, bihal olsun.* C.Məmmədquluzadə. [Əbdül:] *Sara xanımın halı fənalaşır, bihal olub, tez həkim lazımdır.* C.Cabbarlı.

**BİHALƏT** [*fars.* bi... və *ər.* halət] *köhn.* b a x **bihal.** [İrakli] .. *bihalət yıxılır səndəlin üstünə.* Ə.Haqverdiyev.

**BİHALLIQ** *is.* Zəiflik, taqətsizlik; yorğunluq, üzgünlük. *Mana bu zəfü bihallıq, sağınma, pirlikdəndir; Gözün fikri məni yorğun salıb ahu qovanlar tək.* Q.Zakir.

**BİHESAB** *sif.* [*fars.* bi... və *ər.* hesab] 1. Haqsız.

2. Saysız-hesabsız, olduqca çox.

3. *məc.* Hesab bilməyən, anlamaz.

**BİHESABLIQ** *is. köhn.* Haqsızlıq. *Danışma heç bihesablıqdan; Yaxşı olur doğru-düzün axırı.* Aşıq Pəri.

**BİHƏDD** *sif.* [*fars.* bi... və *ər.* hədd] Hədsiz. *Füzulidən səbatü səbrü cövrü qəhr az istə; Kim, ol biçarəyi dərdü qəmin bihədd zəbun etdi.* Füzuli. [Səriyyə:] *Nə çarə edəsən? Sən bir tək, amma bu zalimlər bihədd.* C.Cabbarlı.

**BİHƏYA** *sif.* və *is.* [*fars.* bi... və *ər.* həya] Həyasız, utanmaz. [Səkinə xanım:] *Gülsəba, heç bilirsən ki, mənim bu bihəya qardaşım arvadı başıma nə iş gətiribdir?* M.F.Axundzadə. // Söyüş yerində. [Nurcahan:] *Axırda təqsirli kim oldu, a bihəya?* N.Vəzirov. [Nəcəf bəy:] *A bihəya, heç utanmayırsan?* Ə.Haqverdiyev.

**BİHƏYALIQ** *is.* Həyasızlıq, utanmazlıq. *Bihəyalıq etmək.*

**BİHİSS** *zərf* [*fars.* bi... və *ər.* hiss] Hissiz. *Bihiss halda uzanmaq. – Biçarə kişi bircə onu bildi ki, gücü gəldikcə "Vay dədə, vay!" – deyib, bihiss yerə yıxıldı.* Çəmənzəminli.

**BİHÖRMƏT** *sif.* və *zərf* [*fars.* bi... və *ər.* hürmət] Hörmətsiz. [Səadət xanım:] *Bağışlayın, əgər məndən bihörmət iş baş vermişsə, üzr istəyirəm...* Mir Cəlal. ☐ **Bihörmət etmək** – hörmətdən salmaq, biabır etmək, alçaltmaq. [Bədircahan bəyim:] *A kişi, .. bunların təqsiri nə idi ki, sən bihörmət elədin?* N.Vəzirov. **Bihörmət olmaq** – hörmətdən düşmək, biabır olmaq. *..Hər kim Əlyarovun bir sözünü iki eləməyə cəsarət eləsə, .. ən yüngül cəzası bihörmət olub, işdən qovulmaqdır.* M.Hüseyn.

**BİHÖRMƏTÇİLİK** *dan.* b a x **bihörmətlik.** *Burada nə kötək lazımdır, nə bihörmətçilik, nə də qeyri bir bəhanə.* C.Məmmədquluzadə.

**BİHÖRMƏTLİK** *is.* Hörmətsizlik. *Baba üzrxahlıq etdi: – Xanım, başına dönüm, bihörmətlik olar, xəcalət çəkərəm, – dedi.* Çəmənzəminli. *Məsum kişi .. ömrünün bu çağlarında .. gördüyü bihörmətliyi, eşitdiyi nalayiq sözləri düşündü.* Mir Cəlal.

**BİHUDƏ** *sif.* və *zərf* [*fars.*] Boş-boşuna, əbəs, nəticəsiz, mənasız, faydasız. *Bihudə iş. Bihudə danışıq. Bihudə zəhmət. Bihudə yerə. – Vəfa yoxdur, Vidadi xəstə, əsla nəsli-insanda; Vəli bihudə bir sözdür, deyirlər laf arasında.* M.V.Vidadi. *Buna bax, gör necə yatmış burada asudə; Yazmayır, işləməyir, vaxtı itir bihudə.* A.Səhhət. [Kərim kişi:] *Saqqalımın bu ağ vaxtında tüfəngi bihudə yerə çiynimə salmamışam.* M.İbrahimov.

**BİHUŞ** *sif.* [*fars.*] 1. Özündən getmiş, bayğın. *Sevil bihuş halda yatırdı.* Ə.Sadıq. ☐ **Bihuş olmaq** – özündən getmək, bayılmaq. [Şahın] *haman saat rəngi qaçıb guya ki, bihuş oldu.* M.F.Axundzadə. *..Bilmədim hansı tərəfdən elə bir xırıltı səsi gəldi ki, mən az qaldım bihuş olam.* C.Məmmədquluzadə. *Huşa getmiş uşaq xəyal içrə; Kəsrəti-qüssədən olub bihuş.* C.Cabbarlı.

2. Huşsuz, yaddaşsız, hafizəsiz; fikri dağınıq. *Bihuş adam.*

3. *məc.* Məst, heyran, valeh. ☐ **Bihuş olmaq** – məst olmaq, heyran olmaq, valeh olmaq. *Eşitdim ol qarə göz dilbərim sağərpərəst olmuş; Mey içmiş, məclisi-əğyardə bihuşü məst olmuş.* S.Ə.Şirvani. *Yumşaq otların, əlvan çiçəklərin, dağ nanələrinin gözəl qoxusundan insan bihuş olurdu.* A.Şaiq.

**BİHUŞANƏ** *zərf* [*fars.*] Özündən getmiş kimi, bayğın halda. *Şair bu sözləri vəcd . . halında söyləyərək, bihuşanə yıxılıb, hərəkətsiz qaldı.* A.Səhhət.

**BİHUŞDARI** *is.* [*fars.*] Bihuş-edici (yuxuladıcı) maddə. *Əyyarlar başladılar Dəmirçi oğlunun üstünə bihuşdarı səpməyə.* "Koroğlu".

**BİHUŞEDİCİ** *sif.* Bihuş edən, məstedici. *..Bihuşedici ətir .. şirin bir yuxu gətirmişdir.* İ.Əfəndiyev.

**BİHUŞLUQ** *is.* 1. Bihuş, özündən getmiş adamın halı; bayğınlıq. *Kiçik Lena bihuşluğundan ayıldı, gözlərini açdı.* S.S.Axundov. 2. Huşsuzluq, yaddaşsızlıq, fikri dağınıqlıq. 3. *məc.* Məstlik; heyranlıq, valehlik.

**BİHÜDUD** *sif.* [*fars.* bi... və *ər.* hüdud] Hüdudsuz, nəhayətsiz, ucsuz-bucaqsız. *Dəryayi-bihüdud idi çərxi-zümürrüdin; Könlüm misalı mövcənü biqərar idi.* M.Hadi. // Hədsiz, son dərəcə. *İstəyir məxluq ona təzim qılsın, bihüdud; Saxlasın hər ehtiramın, söyləsin nadir vücud.* C.Cabbarlı.

**BİHÜNƏR** *sif.* [*fars.*] Hünərsiz, bacarıqsız. *Kərəmsiz kimsəni hər yerdə gördüm, bihünər gördüm.* M.V.Vidadi. *..Heç kafər bəndəyə düçar olmasın; Ev-eşiyi murdar, bihünər gözəl.* Q.Zakir.

**BİXƏBƏR** *sif.* və *zərf* [*fars.* bi... və *ər.* xəbər] Xəbərsiz. *Mən bu işdən bixəbərəm. Əhvalatdan bixəbər olmaq. – Məhəbbət ləzzətindən bixəbərdir zahidi-qafil.* Füzuli. *Sirri-dəhanini demə naəhl zahidə; Qoy bixəbər qalıb, belə əsrari qanmasın.* M.Ə.Sabir. *İşdən bixəbər olan Polad Almazın axıtdığı göz yaşından mütəəssir oldu.* A.Şaiq.

**BİXƏTƏR** *sif.* [*fars.* bi... və *ər.* xətər] Xətərsiz, qorxusuz, təhlükəsiz.

**BİİXTİYAR** *zərf* [*fars.* bi... və *ər.* ixtiyar] 1. İxtiyarsız, qeyri-iradi, qeyri-ixtiyari (olaraq), özü istəmədən, özündən asılı olmayaraq. *Biixtiyar ağlamağa başladı. – Məstanə gözlərini görüb sərxoşam müdam; Biixtiyar sakini-meyxanəyəm yenə.* Kişvəri. *Biixtiyar ovcumdakı dəni yerə səpərdim. Cücələr bir-birini döşləyərək səpdiyim dəni dimdiklərdi.* A.Şaiq. [Məryəmin] *gözləri axdı, başı çiyninə əyildi və iki əli də biixtiyar düşüb sallandı.* B.Talıblı.

2. Hüquqsuz, ixtiyarsız, əlində ixtiyarı olmayan. *İmama ixtiyarın vermə, hərgiz uyma, təkbirə; Özün, kim faili-muxtarsən, biixtiyar olma.* S.Ə.Şirvani.

**BİİKRAH** *zərf* [*fars.* bi... və *ər.* ikrah] *köhn.* İkrahsız, nifrətsiz, çiyrənmədən. *Baxan, baxmaq gərək qabaq-qabağa; Göz ucilə baxan biikrah baxar.* M.P.Vaqif.

**BİİQRAR** *sif.* [*fars.* bi... və *ər.* iqrar] İqrarsız, sözünün üstündə durmayan, verdiyi sözdən dönən, dönük. *Bivəfasan, səndən üz döndərmişəm; Yalançıya, biiqrara baxmaram.* M.P.Vaqif.

**BİİMAN** [*fars.* bi... və *ər.* iman] b a x **imansız**. [Çiçək xanım:] *Mən bu xarabaya belə qız vermişdim? Bir dəri qalıb, bir sümük, a biiman!* N.Vəzirov.

**BİİNSAF** [*fars.* bi... və *ər.* insaf] b a x **insafsız**. *Biinsaf adam.* – [Hacı Saleh:] *Neçə dəfə səni dar gündən qurtarmamışam, a biinsaf kişi!* S.S.Axundov.

**BİİNSAFLIQ** b a x **insafsızlıq**.

**BİİNTİHA** *sif.* [*fars.* bi... və *ər.* intiha] İntəhasız, sonsuz; son dərəcə, lap çox. [Muzdur] *xüsusilə düşdüyü bəladan .. xilas olub, divan xatirəsindən qurtulmasına biintiha şakir idi.* S.M.Qənizadə.

**BİİZN** [*fars.* bi... və *ər.* izn] b a x **izinsiz.** [Xan:] *Onun nə həddi var məndən biizn mənim arvadımın otağına girsin.* Ə.Haqverdiyev.

**BİKAM** *sif.* [*fars.*] Kamına çatmamış, arzusuna nail olmamış, muradına çatmamış, istədiyinə qovuşmamış, nakam.

**BİKAR** *sif.* və *zərf* [*fars.*] 1. İşsiz, peşəsiz, məşğuliyyətsiz. *Bikar adam. Bu gün bikaram. Bikar gəzmək. Bikar olanda bizə gəl.* – [Əşrəf bəy:] *Mənim işim belə düşübdür ki, bir dəqiqə bikar otura bilməyirəm..* N.Vəzirov. [Hüseyn:] *Əgər bu cür boş sözün varsa, bikar vaxtında gəl, sən danış, mən də yazım, səhnədə lazım olar.* S.Rəhman. [Şamamanın anası:] *Heç belə vaxtlarda da evdə bikar oturmaq olarmı?* İ.Əfəndiyev.

2. *məc.* Əkilməmiş, toxum atılmamış, ağac əkilməmiş, boş (yer).

**BİKARA** [*fars.* bikarə] 1. *sif. dan.* Gərəksiz, vecsiz, lazımsız, yararsız, faydasız, pis. *Bikara adam. Bikara şey. – Mirzə Həbib cavab verdi ki, xalqın təzə padşahdan zəhləsi gedir. Onu süstrəy və bikara bilirlər.* M.F.Axundzadə.

2. *zərf* Avara, səfil, sərgərdan. *Bikara gəzmək. Bikara dolanmaq. – İllər, aylar gəzirəm boş-boşuna, bikarə; Laübali yaşayış etdi məni avarə.* A.Səhhət.

**BİKARALAŞMAQ** *f. dan.* Gərəksiz, lazımsız, yaramaz bir hala düşmək; xarablaşmaq, pisləşmək, vecsizləşmək.

**BİKARÇILIQ** *is.* b a x **bikarlıq.** *Oxucularımızdan iltimas edirəm ki, "İrşad"ın 79-cu*

*nömrəsində Əhməd bəy*(*in*) *bikarçılıqdan yazdığı altı sütunlu baş məqaləyə diqqət etsinlər.* C.Məmmədquluzadə.

**BİKARLAŞMA** "Bikarlaşmaq"dan *f.is.*

**BİKARLAŞMAQ** *f.* Bikar qalmaq, işsiz qalmaq, heç bir işlə məşğul olmamaq.

**BİKARLIQ** *is.* İşsizlik, avaralıq, işsiz gəzmə. *İttifaqən bazar sənaətlərində rəvac olmayıb, qayət bikarlıqdan* [adamlar] *ac və möhtac qaldılar*. "Tutinamə". *Bu büxlü, bu həsəd, bu göftgü bikarlıqdandır.* S.Ə.Şirvani.

**BİKEF** *sif.* və *zərf* [*fars.* bi... və *ər.* keyf] 1. Kefsiz, bir qədər xəstə. □ **Bikef olmaq** – kefsiz olmaq, bir qədər xəstə olmaq.

2. Qəmli, kədərli, qüssəli, pərt, məyus. [Bədəl:] *Yoldaşlar, daha bundan sonra məni bikef görməzsiniz.* Ə.Haqverdiyev. □ **Bikef olmaq** – kefi yerində olmamaq, kədərlənmək, məyus olmaq. *Bikef olmaq gözəllərə yaraşmaz.* M.P.Vaqif. *Köç yola düşdü. Nurəddin Bahardan ayrılmasına görə bir qədər bikef oldu.* S.S.Axundov.

**BİKEFLƏMƏK** *f. məh.* Əhvalı pozulmaq, pərt olmaq, məyus olmaq. *Ayna bikefləyib cəld aradan çıxdı.* S.Rəhimov. *Anasının nə kimi işgəncəli həyat keçirdiyini eşidən Gülüş də bikefləmişdi.* Ə.Vəliyev.

**BİKEFLİK** *is.* Kefsizlik, əhvalı dəyişmə, pozulma. // Qəmlilik, qüssəlilik, kədərlilik, məyusluq.

**BİKƏS** *sif.* və *is.* [*fars.*] Kimsəsiz, adamsız; heç bir adamı, qohumu olmayan. *Qəriblikdə bikəslərin halını; Fikr elərəm, gözüm dolar qan ilə.* M.V.Vidadi. *Qıldı o bikəsin gözünü əşkbar eşq.* S.Ə.Şirvani.

**BİKƏSLİK** *is.* Kimsəsizlik, adamsızlıq; heç bir adamı, qohumu olmayan adamın halı. *Yetdi bikəsliyim ol qayətə kim, çevrəmdə; Kimsə yox cizginə girdabi-bəladən qeyri.* Füzuli. *Bikəsliyimə, həsrəti-besyarıma rəhm et!* Heyran xanım. *Dadimə yetə ruzi-bəla hiç kəsim yox; Bikəsliyim axır özümə dadrəs etdim.* S.Ə.Şirvani.

**BİKR** [*ər.*] b a x **bakir(ə).**

**BİQAL** *sif.* [*fars.* bi.. və *ər.* qal] *köhn*. Sakit, səs-küy salmayan. *Mən Hacı Abtalıbdan, külfətindən bir pislik görməmişəm və eşitməmişəm, biqal adamdırlar.* H.Sarabski.

**BİQEYD** [*fars.* bi... və *ər.* qeyd] b a x **qeydsiz.** *Balaca uşaqlar gülər sifətləri ilə biqeyd, bağın xiyabanlarında qışqırtı ilə yüyürüşürlər.* Ə.Haqverdiyev.

**BİQEYRƏT** [*fars.* bi... və *ər.* qeyrət] b a x **qeyrətsiz** (bəzən söyüş yerində işlənir). [Nurəddin ağa:] *Bircə mənə de görüm, .. sizin qızlarınız bir naməşru iş görsə, onda kimdir müqəssir? Biqeyrət, binamus həşərat kimdir?* N.Vəzirov. [Arvadı Mahmuda:] *Sən bacının yerinə mənimi* (*ərə*) *verirsən, ay biqeyrət?* B.Talıblı.

**BİQEYRƏTLİK** b a x **qeyrətsizlik**.

**BİQƏDR** *sif.* [*fars.* bi... və *ər.* qədr] *klas.* Dəyərsiz, qədir-qiyməti olmayan, qiymətsiz, gözdən düşmüş, hörmətdən düşmüş. *Sərdən gedəli sayəsi ol sərvi-rəvanın; Biqədr oluban həmrəhü həmsayə dağılmış.* Q.Zakir.

**BİQƏM** [*fars.* bi... və *ər.* ğəm] b a x **qəmsiz.** *Layiq deyil sənə nakəsi-biqəm; Adam gərək ola adama həmdəm.* M.P.Vaqif.

**BİQƏRAR** [*fars.* bi... və *ər.* qərar] b a x **qərarsız.** *İntizarəm vədeyi-vəslin yolunda hər zaman; Hər zəman divanə tək dağlarə düşdüm biqərar*. Xətayi. *Könül dünyada yar istər; Olubdur biqərar, istər.* M.V.Vidadi. *Tez gətir xəbər, qoyma intizar; Etmə çox məni zarü biqərar.* Nəbati. *Cırcırama yaz, bahar, nəğmə oxur biqərar.* A.Səhhət.

**BİQƏRƏZ** [*fars.* bi... və *ər.* qərəz] b a x **qərəzsiz**. [Sərbaz:] *Hətta biz ondan* [Hacı Qafurdan] *bir cüzi xərclik istədik, dedi ki, şahid gərək biqərəz ola.* M.F.Axundzadə. *Giryeyi-zarım vüsalınçın deyil şamü səhər; Biqərəz sövdayi-eşqində bir adətdir mana.* Q.Zakir.

**BİQƏRƏZLİK** b a x **qərəzsizlik.**

**BİQUDİ** *is.* [*fr.*] Saçın qıvrıldılması üçün istifadə olunan metal və ya plastik borucuqlar.

**BİQÜSUR** [*fars.* bi... və *ər.* qüsur] 1. B a x **qüsursuz.**

2. Şübhəsiz (olaraq), yəqin. *Bu gələn cümə biqüsurü güman; Sizə inzal eylərəm baran.* S.Ə.Şirvani.

**BİLAARAM** [*ər.* bila... və *fars.* aram] b a x **aramsız**. *Bilaaram yağış yağır. Bilaaram danışır, yorulmaq bilmir.* – ..*Rza bütün günü bilaaram gah körük basar, gah dəmir*

*döyərdi.* M.İbrahimov. *Kəpənəklər alabəzək qanadlarını bilaaram titrədərək, nəşə ilə uçurdular.* İ.Əfəndiyev.

**BİLAFƏRQ** *zərf* [*ər.*] *köhn.* Fərq etmədən, fərq qoymadan, seçmədən; başdan-başa, ucdantutma. [Müharibə] *yaxşı və yaman otların hamısını bilafərq biçib məhv edir.* M.S.Ordubadi.

**BİLAİXTİYAR** [*ər.*] b a x **biixtiyar.** *Mahmud bilaixtiyar sobanın qabağında çömbəldi.* Ə.Əbülhəsən. *Səttar bu sözləri o qədər ciddiyyətlə dedi ki, kürd bilaixtiyar onun üzünə baxdı.* P.Makulu.

**BİLAİSTİSNA** *zərf* [*ər.*] İstisnasız (olaraq), heç kəsi, heç şeyi aradan çıxmayaraq, hamı (hamısı) daxil olmaq üzrə. *Bilaistisna hamı iclasa gəlməlidir. – Mirzə Fətəli feodalizm quruluşuna və onun bilaistisna bütün əxlaqi, mənəvi qanunlarına qarşı çıxır.* M.İbrahimov.

**BİLAMƏMANİƏT** *zərf* [*ər.*] *köhn.* Arada heç bir maneə olmadan; maneəsiz, əngəlsiz; asanlıqla. – *Bu gündən qohumlar bilaməmaniət bir-birinin evinə gedib-gəlməyə başladılar.* Ə.Haqverdiyev.

**BİLATƏXİR** *zərf* [*ər.*] Təxirsiz (olaraq), gecikmədən, yubanmadan, təcili, tez. [Əşrəf bəy:] *Təvəqqe eləyirəm bilatəxir təşrif aparasız.* N.Vəzirov. *..Ta hökm sənə çatan tək, bilatəxir qoşunu mənə yetirəsən..* Ə.Haqverdiyev. *Ruznamə bilatəxir bu adamların edam olunmasını tələb edir.* M.İbrahimov.

**BİLATƏŞBEH** *zərf* [*ər.*] *köhn.* Bənzədilməsi arzu olunmayan, yaxud günah sayılan şey haqqında deyilir. [Hacı:] *Fağır-füqəraya əl tutmuşam, elə biri də bilatəşbeh, lap olsun sənin qızın!..* Mir Cəlal.

**BİLAVASİTƏ** *zərf* [*ər.*] Vasitəsiz olaraq, arada heç bir vasitə olmadan; arada heç bir şey (şəxs) iştirak etmədən; birbaşa. *Bilavasitə mərkəzi idarələrə müraciət etmək. Bilavasitə rəhbərlik etmək. Məktubu bilavasitə sahibinə vermək. O, bilavasitə qonşuluğumda yaşayır. – Lakin bilavasitə* [Əhmədin] *işə girişməyə maddi vəsaiti müsaidə verməyirdi.* B.Talıblı.

**BİLAYİQ** [*fars.* bi... və *ər.* layiq] b a x **ləyaqətsiz.** [Zaman:] *Mən heç vədə Qədimə bilayiq oğlan demərəm.* Ə.Haqverdiyev.

**BİLCÜMLƏ** *zərf* [*ər.*] *köhn.* b a x **bilümum.** *Bir gün gələ bidar ola bilcümlə camaət; Təzviri-ibadətdən edə fərq bu millət.* M.Ə.Sabir.

**BİLDAPARAT** *is.* [*alm.*] Teleqraf (fotoelektrik) vasitəsilə şəkil, əlyazmasını və s.-ni uzaqlara vermək üçün aparat.

**BİLDİR** *zərf* Keçən il, ötən il, əvvəlki il. *Bildir havalar çox quraqlıq keçdi. Bildir harada istirahət etmişdin? – Bildir ölüb babası, indi deyir "babam vay"!* (Ata. sözü). *Mən ləqəb sözünü bildirə kimi bilməzdim.* C.Məmmədquluzadə. *..İnstitutu bildir qurtarmış Qorxmaz .. cəbhədən yeni qayıtmış Mədədə fəxrlə baxıb deyirdi...* Ə.Vəliyev.

**BİLDİRÇİN** *is.* Quşların toyuqkimilər dəstəsindən olan, taxıllıqlarda yaşayan, oxuyan, əti yeyilən çöl quşu. *Bildirçinin bəyliyi darı sovulanacandır.* (Ata. sözü). [Süleyman bəy:] *Çıxmışdım şəhərdən çölə bildirçin tutmağa..* Ə.Haqverdiyev. *Bildirçinlər səhər günəş doğarkən, axşam günəş batarkən oxuyurlar.* C.Cabbarlı.

**BİLDİRÇİNBAZ** *is.* [*fars.*] Əyləncə üçün bildirçin saxlayan adam, quşbaz. [Süleyman bəy:] *Aləm bilir ki, mən bildirçinbazam.* Ə.Haqverdiyev. *Mollaxanadan qovulan gündən etibarən uşaq fikrini qumarbazlıq, .. bildirçinbazlıq, itbazlıq və bu kimi işlərə verərdi.* H.Sarabski.

**BİLDİRİLMƏ** "Bildirilmək"dən *f.is.*

**BİLDİRİLMƏK** *məch.* 1. Məlumat verilmək, xəbər edilmək, xəbərdar edilmək. *İclasın olacağı gün hamıya qabaqcadan bildirilmişdir.*

2. Anladılmaq, başa salınmaq, hiss etdirilmək. *Əgər ona bildirilsəydi, belə etməzdi.*

**BİLDİRİŞ** *is.* Elan, məlumat; xəbərdarlıq. *İclas haqqında bildiriş. Bildiriş vərəqəsi.*

**BİLDİRKİ** *sif.* Keçən ilə aid olan, keçən il olmuş, keçən ilki. *Bu ilki sərçə bildirki sərçəyə cik-cik öyrədir.* (Məsəl). *İndi yenə bildirki vaxtdır, yenə təntənəli vədlər verilir.* "Kirpi".

**BİLDİRMƏ** "Bildirmək"dən *f.is.*

**BİLDİRMƏK** *f.* 1. Məlum etmək, xəbər vermək, elan etmək, xəbərdar etmək. – *Şerim, bu hikməti aləmə bildir; Xəyal ölənləri bəzən dirildir.* M.Rahim.

2. Anlatmaq, açıb söyləmək, başa salmaq, hiss etdirmək. *Fikrini bildirmək. Adını bildirmək. O, ürəyini heç kəsə bildirən deyil. – Kərim bəy bacının qardaş haqqındakı sözündən kövrəlsə də, bildirmədi.* Mir Cəlal.

**BİLÉT** [*fr.*] 1. Kitabça, kartoçka, vərəqə və s. şəklində olub, sahibinin partiyaya və ya hər hansı bir ictimai təşkilata mənsubiyyətini təsdiq edən sənəd. *Partiya bileti. Komsomol bileti. Həmkarlar ittifaqı bileti.* // Sahibinin hərbi mükəlləfiyyətli, yaxud bir məktəbə və s.-yə mənsub olduğunu təsdiq edən sənəd. *Hərbi bilet. Tələbə bileti.* // Ümumiyyətlə, sənəd, vəsiqə.

2. *mal*. Kağız pul. *Dövlət xəzinəsi bileti. Kredit bileti. Bank bileti.*

3. Bir yerə daxil olmaq, nəqliyyat vasitəsinə minmək, bir şeydən istifadə ixtiyarı verən vərəqə, kartoçka və s. *Dəmiryol bileti. Tramvay bileti. Teatr bileti. Kino bileti. Bilet kassası. Heyvanxanaya bilet almaq.* – [Hacı Saleh:] *Axı onu bir başa salın ki, hələ biletləri satmamışıq.* S.Rəhman.

4. *köhn*. Pasport. *İrəvanda da, deyirlər, vitse-konsulun köməkçisi biletin birinə İran rəiyyətindən düşəndə on manat alır.* C.Məmmədquluzadə.

5. İmtahanda tələbənin, şagirdin cavab verməli olduğu suallar yazılmış vərəqə. *İmtahan bileti. – İmtahan... Kimi cəsarətlə çəkir bileti; Kimi qorxa-qorxa yanaşır mizə.* B.Vahabzadə.

**BİLETÇİ** *is.* Qatarda, tramvayda və s.-də bilet satan, yaxud biletləri yoxlayan işçi. *Vaqonun biletçisi yeni sərnişinlərin bir neçəsini vaqona buraxıb yer göstər*(*di*). T.Ş.Simurq.

**BİLETSATAN** *is.* Teatra, kinoya və s.-yə bilet satan işçi.

**BİLETSİZ** *sif.* və *zərf* 1. Bileti olmayan. *Biletsiz sərnişinlər cərimə olunur. Tramvayda biletsiz getmək. – O gecə binanın dörd bir tərəfi camaatla dolu idi. Biletlər saat 4-dən qurtardığına görə camaat biletsiz içəri doluşurdu.* H.Sarabski.

2. *köhn*. Pasportsuz. [Kərəməli:] *Mən bir yol buradan Salyana biletsiz getmişdim...* M.F.Axundzadə.

**BİLƏ** *zərf köhn. məh.* Birgə, birlikdə. *Bilə yeyib, bilə də gəzərdik. – Bilə gəl gedəlim bu qutlu yola.* ("Dastani-Əhməd Hərami").

**BİLƏ-BİLƏ** *zərf* Qəsdən, bildiyi halda. *Bilə-bilə etmək. – Lotular bir neçə dəfə bilə-bilə və pullarından Rəsula uduzdular.* "Aşıq Qərib". *Mən bilə-bilə qəsdən özümü cəhənnəmdə yandırmaram!* M.S.Ordubadi.

**BİLƏK** *is.* Qolun dirsəkdən ələ qədər olan hissəsi. *Gümüş biləklərin, bəyaz qolların; Sarı kəhrəbası, hayıf ki, yoxdur!* M.P.Vaqif. [Qaraca qız] *həyətə çatdıqda gördü ki, Ağca xanımın biləyindən qan axır..* S.S.Axundov. *Bunu deyərək, mayor Ulduzun nazik uşaq biləklərinə baxdı.* Ə.Məmmədxanlı.

◊ **Biləyə dolamaq (sarımaq)** – ələ salmaq, dolamaq, oynatmaq, sarımaq.

**BİLƏKS** *zərf* [*ər.*] Əksinə, əksinə olaraq, tərsinə, tərsinə olaraq, ziddinə olaraq; tamamilə başqa cür. [Nizami:] *Mən heç bir zaman həqiqəti təhrif etməmişəm, biləks, təhrifçilərin düşməni olmuşam.* M.S.Ordubadi. [Mələk:] *Lakin sizi ayırmaq deyil, biləks, əbədi bir eşqlə, sönməz bir məhəbbətlə qovuşdurmaq istərdim.* H.Cavid.

**BİLƏN** *sif.* Anlayan, qanan, başa düşən; bilici. *Qəbiristanda qulyabanı olmaz, xortdandır, – deyə başqa bir uşaq da söhbətə girişərək, bilən adamlar kimi .. izahat verdi ..* B.Talıblı. // İs. mənasında. *Bilənlə bilməyən tay olmaz.* (Ata sözü). [Muradlı:] *Bilən, bilməyən, hamınız barmaq qaldırın.* Mir Cəlal.

**BİLƏNDƏ(R)** *is.* və *sif. dan.* Bilici, çoxbilən, məlumatlı (adam).

**BİLƏRƏK** *zərf* Qəsdən, bilə-bilə. *Bilərək etmək. Bilərək dinməmək.*

**BİLƏRZİK** *is.* 1. Qadınların yaraşıq üçün biləklərinə taxdıqları gümüş, qızıl və s.-dən qayrılmış halqa; qolbaq. *Qızıl bilərziklər, mina sırğalar; Biləkdən açılar, qulaqdan çıxar.* M.S.Ordubadi.

2. *xüs.* Çənbər, qurşaq. *Qazıma boruları, onların bilərzikləri, ağır borular "D" və "E" markalı marten poladından hazırlanır.* Quliyev.

**BİLƏRZİKLİ** *sif.* 1. Qoluna bilərzik taxmış.

2. *xüs*. Bilərziyi olan (b a x **bilərzik** 2-ci mənada).

**BİLƏSİNCƏ** *zərf köhn*. Yanınca, özü ilə bərabər, arxasınca. *Bəs Bəkir İsfəndiyarı biləsincə götürüb apardı.* "Dərbəndnamə". *Çəkdi ləşkər biləsincə neçə yol qeyrət qılıb.* M.V.Vidadi.

**BİLƏYAQƏT** *sif.* [*fars.* bi... və *ər.* liyaqət] Ləyaqətsiz, ləyaqəti olmayan. *Candan qeyri yoxdur özgə nisarım; O da ki, ziyadə biləyaqətdi.* Q.Zakir.

**BİLƏZİK** b a x **bilərzik.**

**BİLƏZİKLİ** b a x **bilərzikli.**

**BİLƏZZƏT** *sif.* [*fars.* bi... və *ər.* ləzzət] Ləzzətsiz, dadsız. *Olmasa qabil əgər dəhr cəfa verməz ona; Təm biləzzət olanda necə dəndanə dəyər?* M.V.Vidadi.

**BİLGİ** b a x **bilik.** [Məşədi Kazım ağa:] *Lakin bu bilgini həyata keçirmək məsələsinə gəldikdə, necə ki mən, elə də başqaları ingilis və rus tacirlərinin qabağında bir iş görə bilmirik...* M.S.Ordubadi. *Şən alnında bilgi, zəka ulduzları parıldar.* A.Şaiq.

**BİLGİLİ** b a x **bilikli.**

**BİLGİSAYAR** b a x **kompyuter.**

**BİLXASSƏ** *zərf* [*ər.*] *köhn.* b a x **xüsusən.**

**BİLİCİ** *sif.* və *is.* Bilən, anlayan, dərk edən, düşünən. *Bilici adam.* – [Araz:] *Mən bunu bilici adamlardan soruşub öyrənəcəyəm.* A.Şaiq.

**BİLİCİLİK** *is.* Bilici adamın hal və keyfiyyəti. *Sümsünü indi mən çalır, o* [Kərim baba] *isə öyrədirdi və biliciliyi ilə öyünüb, məğrur baxışlarla mənə baxıb gülürdü.* A.Şaiq. // Alimlik, vaqiflik, xəbərdarlıq.

**BİLİXTİYAR** *zərf* [*ər.*] *köhn.* Öz ixtiyarı ilə, öz xahişi ilə, öz iradəsi ilə.

**BİLİK** *is.* Oxumaq və ya təcrübə nəticəsində əldə edilən məlumat; elm. *Bilik insanın bəzəyidir. Onun dərin biliyi var. Biliyini artırmaq.* – *Tifli-məsumlar imtəhan tutdu; Başlarında bilik məkan tutdu.* A.Səhhət. *İndi gənclik Bakını sevir, indi Bakı onlar üçün işıq və bilik mənbəyi olmuşdur.* M.Hüseyn.

**BİLİKLƏNMƏ** "Biliklənmək"dən *f.is.*

**BİLİKLƏNMƏK** *f.* Bilik əldə etmək.

**BİLİKLİ** *sif.* Bilik sahibi, məlumatlı, elmli, hazırlıqlı. *Bilikli adam.*

**BİLİKSİZ** *sif.* Biliyi olmayan, məlumatsız, elmsiz, hazırlıqsız. *Biliksiz və siyasi düşüncəsi olmayan adamların silahları da qələbə qazana bilməz.* M.S.Ordubadi.

**BİLİKSİZLİK** *is.* Məlumatsızlıq, elmsizlik, hazırlıqsızlıq.

**BİLİNMƏ** "Bilinmək"dən *f.is.*

**BİLİNMƏK** *f.* 1. Məlum olmaq, aşkar olmaq, bəlli olmaq, anlaşılmaq, dərk edilmək. *Böyük bir keçmişin vardır; Bilinməyir yaşın sənin.* S.Vurğun.

2. Tanınmaq. *Nəqqaş bilindi nəqş içində; Ləl oldu əyan bədəxş içində.* Nəsimi.

**BİLİNMƏZ** *sif.* Anlaşılmaz, dərkedilməz, məlum olmayan; bilinməsi mümkün olmayan; sirli.

**BİLİŞ** *is.* 1. Bilmək işi, bilmə.

2. Bilik, mərifət. *Aşinayi bilməmişsən, ey bilişdən yad olan; Mərifətdən dəm vurursan, neyləyim, biganəsən.* Nəsimi.

3. *köhn.* Dost, yaxın, tanış. *Yad olmişəm yenə bu gün biliş ilə, nedəyin.* Q.Bürhanəddin. *Ey bilişim, məndən axır olma yad.* Yusif Məddah.

**BİLİTTİFAQ** *zərf* [*ər.*] *köhn.* İttifaq ilə, birgə, bir yerdə.

**BİLKÜLLİYYƏ** *zərf* [*ər.*] *köhn.* Tamamilə, büsbütün, bütünlüklə. [Şölə xanım:] *Əlbəttə, gərəkdir vəzir bu işləri bilməyə, yoxsa xana bildirər, iş bilkülliyyə pozular.* M.F.Axundzadə.

**BİLLAH** [*ər.*] *köhn.* Allaha and olsun (and). *Yar cövr etməz mana, əğyar təlim etmədən; Billah, əğyar eyləyən ehsanı yar etməz mana.* Füzuli. *Riyai xəlqdir, billah, namaz əhlinə yar olma.* S.Ə.Şirvani. *Xərcin tükənib kəsilmir ardı; Billah, dəxi pullarım qutardı.* M.Ə.Sabir.

**BİLLƏ** *is. məh.* Uşaqlara verilən hər cür şirniyyat, meyvə və s. dadlı şeylər.

**BİLLİON** [*fr.*] Rus, fransız və Amerika hesab sistemində min milyona (bir milyarda), yaxud alman və ingilis sistemlərində bir milyon milyona (min milyarda) bərabər olan say.

**BİLMƏ** "Bilmək"dən *f.is.*

**BİLMƏDƏN** *zərf* 1. Bilmədiyi halda, bilməyə-bilməyə. *Bilmədən danışma.*

2. B a x **bilməyərək.**

**BİLMƏK** *f.* 1. Bir şey haqqında məlumatı olmaq, xəbərdar olmaq, vaqif olmaq. *Mən bunu çoxdan bilirdim. Bu xüsusda mən heç bir şey bilmirəm. Bilirsənsə, gəl söylə. Mən sənin fikrini bilmək istərdim.* – *Ey dil, aman-*

*dı, sirrini biganə bilməsin.* M.Ə.Sabir. *Qoy həqiqəti bilməyənlər bilsinlər.* Ə.Haqverdiyev. // Hər hansı bir sahədə xüsusi biliyi, səriştəsi olmaq, yaxşı bələd olmaq. *Ədəbiyyatı yaxşı bilmək. Bir neçə dil bilmək. Maşını yaxşı bilmək.*

2. Öyrənmək, xəbər tutmaq, məlumat almaq. *Onun adını indicə bildim. Sizin gəldiyinizi təzəcə bilmişəm. Qatarın nə vaxt gələcəyini bildinmi? – Bağışla, bilmişəm biganələrlə aşinasənmiş.* S.Ə.Şirvani.

3. Başa düşmək, dərk etmək, aydın təsəvvür etmək. *Mən bilirəm ki, bu iş baş tutmayacaq. Bilmirsən ki, gecikmək olmaz? Bunu yaxşı bil! – Bilməyən yoxdu kim bu mənanı; Tərbiyət kamil eylər insanı.* S.Ə.Şirvani. [Qoca:] *Bilin ki, bu şəhərin hər bir daşına bir igidin qanı tökülüb...* M.Hüseyn. // Sezmək, duymaq, hiss etmək, anlamaq. *Mən o saat bildim ki, o nəyi nəzərdə tutur.*

4. Tanımaq. *Adamları bilmək olmur.*

5. Əlindən gəlmək, təsəvvürü olmaq, bacarmaq. *Dülgərlik işini bilmək. Öz işini yaxşı bilmək. O, bir neçə sənət bilir. Mən çalğı çala bilirəm.*

6. Özü üçün aydın etmək, müəyyən etmək, öyrənmək. *..Həkim azarlının azarını biləndən sonra .. xolera tutana "butin" davası verir...* C.Məmmədquluzadə.

7. Riayət etmək, yerinə yetirmək, hesablaşmaq, kənar çıxmamaq. *Öz yerini bilmək. Vəzifəni yaxşı bil! Adam danışanda həddini bilər.*

8. Xatırlamaq, yada salmaq. *İndi bildim ki, o kimlərdəndir. Bilmədim ki, sizə nə vaxt gəlmişdim.*

9. Zənn etmək, güman etmək. *Mən elə bildim ki, siz getmişsiniz.*

10. Hesab etmək, zənn etmək, saymaq. *Bu işdə kimi müqəssir bilirsən? – Zövqü sadə gülüş bilmək, heç bir kəsə əfv olunmaz.* S.Vurğun. // *dan.* Şübhələnmək, isnad vermək, görmək. *Mən bu işi ondan bilirəm.*

11. Yardımçı feil kimi iltizam fellərinin axırına gətirilərək, feilin bacarıq forması düzəldilir, məs.: dura bilmək, qaça bilmək, yaza bilmək və i. a.

12. **Bilirsən (bilirsiniz), bilsən(iz)** (ara söz mənasında) – müsahibin diqqətini əsas mətləbə cəlb etmək üçün işlənir. *Axşam, sabah, çeşmə, sənin başına; Bilirsənmi, necə canlar dolanır?* Aşıq Ələsgər.

13. İnkar şəklində: **bilməmək** – bir sıra sözlərə qoşularaq, həmin sözlərin ifadə etdiyi şeyin, keyfiyyətin, halın mövcud olmadığını bildirir; məs.: yuxu bilməmək (heç yatmamaq), istirahət bilməmək (heç istirahət etməmək), basılmaq bilməmək (heç basılmamaq) və i.a.

◊ **Bildiyindən qalmamaq** – təkid və israr etmək, inad etmək, bildiyindən əl çəkməmək, öz bildiyini etmək. *Sənə söz deyilir, amma sən bildiyindən qalmırsan.* **Mən biləsi, mən bilən(i)** – məncə, mənim fikrimcə, mənim zənnimcə. *Mən biləsi dünyada şəxs gərək elə bir iş tutsun ki, onu bacarıb yerinə yetirməyə qabiliyyəti olsun.* C.Məmmədquluzadə. **Kim bilir** (ara söz) – məlum deyil. *Kim bilir, maşın nə vaxt gələcək.* **Özü bilər** – nə istəyir, elə də etsin, ixtiyar özündədir, öz hərəkətində sərbəstdir.

**BİLMƏMƏZLİK** *is.* 1. Anlamama, xəbəri olmama; xəbərsizlik, məlumatsızlıq. ☐ **Özünü bilməməzliyə qoymaq** – özünü qəsdən bilməyən, tanımayan kimi göstərmək. *Yoldaşını gördü, özünü bilməməzliyə qoydu. – Mahmud isə özünü bilməməzliyə qoyub, xam adamlar kimi üzünü o tərəfə çevirirdi və sanki heç zad görməyirdi.* B.Talıblı.

2. Haqq və yaxşılıq itirmə.

**BİLMƏRRƏ** *zərf* [*ər.*] Heç, əsla, heç bir dəfə, qətiyyən, tamamilə, büsbütün. *Bir qədər keçəndən sonra musiqiyə olan həvəsim o qədər azaldı ki, başıbəlalı düdüyü bilmərrə gözdən saldım.* C.Məmmədquluzadə. *Hacı Xəlilin səsi gəldikcə zəifləşirdi, axırda nəfəs bilmərrə qət olub, yavaş-yavaş dodaqları tərpənirdi.* Ə.Haqverdiyev. *Gecə tozlu və soyuq olduğuna görə, adamların ayağı küçə-bazardan bilmərrə çəkilmişdi.* S.M.Qənizadə.

**BİLMƏYƏRƏK** *zərf* Qəsdi olmadan, istəmədiyi halda. *Qız özü bilməyərəkdənmi, Vasyanı çaşdırmaq üçünmü – əvvəlcə qərarlaşdırdığı mövzudan kənara çıxdı.* M.S.Ordubadi.

**BİLÜMUM** *zərf* [*ər.*] *köhn.* Ümumiyyətlə, hamılıqla, ümumən, bütün, tamamilə. *Və bir*

*də bu məktəblilər bilümum; Oxurlar kamalınca ali ülum.* M.Ə.Sabir.

**BİLVASİTƏ** *zərf* [*ər.*] Arada vasitə olmaq üzrə; başqasının iştirakı ilə, vasitəsi ilə, köməkliklə (*bilavasitə* ziddi). [Qız:] *Bu məqsədin həyata keçməsində bilvasitə iştirak edənlər xain və avantüraçı sayılmırlarmı?* M.S.Ordubadi.

**BİLYÁRD** [*fr.*] 1. Üzərinə mahud çəkilmiş xüsusi miz üstündə şarlarla oynanılan oyun. *Bilyard oynamaq. Bilyard şarı. – Maşallah, gecə-gündüz valimiz; Çalır partapiyan, oynayır bilyard.* Q.Zakir. *Bu oğlan bilyard oyununu özünə peşə eləmişdi.* Ə.Haqverdiyev.

2. Bu oyun üçün bortları və yanlarında kisəcikləri (torları) olan miz. *Onlar bilyard taxtası üstündə toqquşan şar kimi bir-birindən aralanıb uzaqlaşırdılar.* Ə.Əbülhəsən.

**BİLYARDÇI** *is.* Bilyard oynamağı sevən, yaxşı bilyard oynayan adam.

**BİLYARDXANA** *is.* [*fr.* bilyard və *fars.* ...xanə] Bilyard oynanılan yer. *Mirzə Cavadın .. oğlu şəhərdən əl çəkməyib gecə-gündüz vaxtını bilyardxanalarda keçirirdi.* Ə.Haqverdiyev.

**BİMAR** *sif.* və *is.* [*fars.*] Xəstə, naxoş, azarlı. *Barilaha, gülzarına qıyma sən; Xəstə düşüb, bimarına qıyma sən!* Aşıq Pəri. *Bir təbibə gedib də bir bimar; Dedi: mədəmdə ağrı bir şey var.* M.Ə.Sabir. *Vahidəm, bimari-eşqəm, qeyridən yox minnətim.* Ə.Vahid.

**BİMARXANA** *is.* [*fars.*] *köhn.* Xəstəxana.

**BİMARİSTAN** *is.* [*fars.*] *köhn.* Xəstəxana. *Dövlət tərəfindən hər yerdə zükur və ünas bimaristanları olurdu...* M.F.Axundzadə.

**BİMARLIQ** *is.* Xəstəlik, naxoşluq. *Çəkmə zəhmət, çək əlin tədbiri-dərdimdən, təbib; Kim, deyil sən bildiyin mən çəkdiyim bimarlıq.* Füzuli.

**BİMBİZ** *sif.* 1. Ucu çox şiş, ucu çox iti və nazik. *Bıçağın ucu bimbizdir.*

2. Çox dik.

**BİMEHR** *sif.* [*fars.*] *köhn.* Sevgisi, məhəbbəti olmayan. *Bimehr gözəllərdən aləmdə vəfa umma.* Ə.Vahid.

**BİMƏKAN** *sif.* [*fars.* bi... və *ər.* məkan] Məkansız, yersiz-yurdsuz. *Həsrətindən xəstə düşdüm; Mən biməkan, ağrın alım.* Aşıq Əsəd.

**BİMƏQAM** *sif.* [*fars.* bi... və *ər.* məqam] Yersiz, münasibətsiz. *Ayırdı məndən o məhruyi biməqam fələk.* S.Ə.Şirvani.

**BİMƏNA** *sif.* və *zərf* [*fars.* bi... və *ər.* məna] Mənasız. *Bimənа söz. Biməna söhbət.* – [Ağa Kərim xan:] *..Bu sözləri nə üçün biməna danışırsan?* N.Vəzirov.

**BİMƏRHƏMƏT** *sif.* [*fars.* bi... və *ər.* mərhəmət] Mərhəmətsiz, insafsız, rəhmsiz, zalım. *Bimərhəmət əyanlarına şükr, xudaya!* M.Ə.Sabir. *Nədir bu xilqəti-bimərhəmət, bu pərdəli hikmət? Bu zülmə qarşı, nolur, bir də bir ədalət olaydı.* H.Cavid.

**BİMƏRİFƏT** *sif.* [*fars.* bi... və *ər.* mərifət] Mərifətsiz. *İnsana şərəfbəxş fəqət elmü hünərdir; Bimərifət adəm canı yox xüşk şəcərdir.* M.Hadi.

**BİMƏRİFƏTLİK** *is.* Mərifətsizlik.

**BİMƏSRƏF** *sif.* [*fars.* bi... və *ər.* məsrəf] *köhn.* 1. Yersiz, bihudə, boş yerə, faydasız. *Biməsrəf yerə pul xərc etmə.*

2. Karagəlməz, lüzumsuz, heç şeyə yaramaz. [Hacı Qənbər:] *Ay gədə, sən qəribə biməsrəf adamsan, heç zad əlindən gəlməyir...* N.Vəzirov.

**BİMƏZƏ** *sif.* [*fars.*] 1. Dadsız, tamsız, heç bir dadı olmayan.

2. *məc.* Boş, mənasız, şit, duzsuz. *Biməzə söz. Biməzə söhbətlər.*

**BİMƏZMUN** *sif.* [*fars.* bi... və *ər.* məzmun] Məzmunsuz. *..Sədi və Hafizdən sonra İranda şeir qayətdə tənəzzülə düşüb, şüəranın əşarı küllən biməzmun və məhz puç ləffazlıq olmuşdur.* M.F.Axundzadə. [Qurban Mərəndi:] *Bu kobud, biməzmun və biməna ləhcədə yazılmış şeyləri bir kənara at.* M.İbrahimov.

**BİMİNNƏT** *sif.* [*fars.* bi... və *ər.* minnət] 1. Minnətsiz.

2. Pulsuz, müftə, havayı. *Dolaşıb bulvarı hər gün gəzərsən biminnət.* M.Ə.Sabir.

**BİMİSL** *sif.* [*fars.* bi... və *ər.* misl] Misilsiz, tayı-bərabəri olmayan.

**BİMUZD** *sif.* və *zərf* [*fars.*] Muzdsuz, zəhmət haqqı verilməyən, ücrətsiz; havayı, müftə. [Mirzə:] *Rəhmətlik oğlu, mən məgər burada hambali-bimuzdəm?* Ə.Haqverdiyev. [Zindalı:] *Yəhya lələ, o nə deyən sözdür? Sənin deməyindən bu il bimuzd olacağıqmı?* Mir Cəlal.

**BİMÜRÜVVƏT** *sif.* [*fars.* bi... və *ər.* mürüvvət] Mürüvvətsiz, insafsız, amansız, rəhmsiz; ədalətsiz. // Bəzən söyüş kimi işlənir. [Fərhad:] *Nainsaf zalımlar, bimürüvvət cəlladlar!* Ə.Haqverdiyev.

**BİMÜRÜVVƏTLİK** *is.* Mürüvvətsizlik, insafsızlıq, rəhmsizlik, ədalətsizlik. *Hər günüm hicrində, ey məh, bir qiyamətdək keçər; Bimürüvvətlikdir olsa bunlar ömrümdən hesab.* S.Ə.Şirvani.

**BİMÜRVƏT** *dan.* bax **bimürüvvət.** *Ay bimürvət, nədir mənim günahım; Çəkirsən zülfündən dara sən məni.* Aşıq Hüseyn. [Vaqif:] *Vidadi, qardaşım, sənmisən, gəl-gəl; Bizi ayrı saldı bimürvət əcəl.* S.Vurğun.

**BİNA** *is.* [*ər.*] 1. Tikili, mülk, ev. *Gözəl və yüksək bina. Məktəb binası. Daş bina. Yeni teatr binası.* – [Mədəd] *vağzalın böyük binasından keçib, relslərin üstündən adlayaraq, depoya tərəf getdi.* M.İbrahimov. *Ferma müdiri .. məni binaya apardı.* İ.Əfəndiyev. *Oynamaq üçün teatr binası yox idi.* S.Rəhman. // Məc. mənada. *Musiqi binasının möhkəm təməlini təşkil edən 12 sütun 12 əsas məqamı və 6 bürc isə 6 avazatı təmsil edirdi.* Ü.Hacıbəyov. *Sevgi və məhəbbət binasının davamı onun möhkəm bir təməl üzərində qurulmasından asılıdır.* M.S.Ordubadi.

2. *dan.* Bünövrə, özül, təməl, əsas. *Evin binası. Dəmir-beton bina. Anbarın binası daşdandır.* // Məc. mənada. *Azərbaycan*(*lıların*) *danışdığı dilin şivəsi çox isə də, binası və kökü birdir.* F.Köçərli. ☐ **Bina edilmək** – bax **bina olunmaq. Bina etmək** – 1) təsis etmək, əsasını qoymaq. *..Bu qəzetənin idarəsində mən elə bir yoldaşa rast gəldim ki, onun .. yoldaşlığı ilə "Molla Nəsrəddin" məcmuəsini bina etdim.* C.Məmmədquluzadə; 2) *məc.* düzəltmək, təşkil etmək, qurmaq. *Oldu siçanlarda əyan macəra; Eylədilər təziyə bəzmin bina.* S.Ə.Şirvani. **Bina ol(un)maq** – tikilmək, qurulmaq, təsis edilmək, əsası qoyulmaq. *Bu əski imarətin tarixini bilirsinizmi? Kim tərəfdən bina olmuş?* S.S.Axundov. [İsgəndərzadə:] *Bu kənd bina olandan məktəb görməyibdir.* Ə.Haqverdiyev; // Məc. mənada. *Bu qəzet kim, olub cahanda bina; Bunu kim ixtira edib, aya?* S.Ə.Şirvani. **Bina qoymaq** – 1) tikmək, təsis etmək, qurmaq, özül atmaq. *Məşədi Əsgər tərəqqi edəndən sonra, öz köhnə muzdur yoldaşlarından bir neçələrini başına yığıb, onlara əl tutmaq üçün gəmiçilik şirkəti bina qoydu.* S.M.Qənizadə; // Məc. mənada. [Süleyman bəy:] *Budur, iki ildir mənimlə dostluq binası qoyublar.* Ə.Haqverdiyev; 2) məc. *köhn.* Həll etmək, çarə düşünmək, əncam çəkmək. [Səkinə xanım:] *İndi dur get, Əzizbəyi bura çağır, görüm bu işə nə bina qoyur?* M.F.Axundzadə; 3) qəsd etmək, istəmək, başlamaq, təşəbbüs etmək. [Məşədi] *istədi dükan qonşusu ilə politika söhbəti bina qoysun.* Ə.Haqverdiyev. **Binası qoyulmaq** – bax **bina olunmaq.** *Həmin binası qoyuldu möhkəm; Gülümsər kainat, gülümsər həyat.* S.Vurğun. **Binasını qoymaq** – 1) bax **bina etmək;** 2) *məc.* başlamaq. *Qara köpək .. Qaraca qızın səyi ilə azacıq sakit oldu və axırda pişiyə də dəyməyib onunla dostluq binasını qoydu.* S.S.Axundov.

3. Çıx. halda: **binadan** – ibtidadan, lap əvvəldən, əzəldən. *Ənliyi-kirşanı neylər camalın; Sən elə gözəlsən binadan, Pəri.* M.P.Vaqif. *Pəriyəm, söylərəm şahü gədadan; Qafiyə dilpəsənd gərək binadan.* Aşıq Pəri. *Çünki olar ilə başdan, binadan; Birevli kimiyiz ata-babadan.* Q.Zakir.

**BİNAƏN** *qoş.* [*ər.*] *köhn.* Görə, əsasən, ötrü. *Bu gün bir az işim olduğuna binaən mehmanxanaya təxirlə qayıtdım.* M.S.Ordubadi. ☐ **Ona binaən** *bağl. köhn.* – ona görə. *Ona binaən onu* [Yusifi] *uşaq ikən gətirib, şəhri-Qəzvində məktəbə qoydu.* M.F.Axundzadə. [Amilaxvari:] *Ona binaən yazıb müqərrər edirəm ki, .. qalan qoşunu hazırda saxlayıb mənim əmrimə müntəzir olasan.* Ə.Haqverdiyev. **Binaən ileyh** *köhn.* – bax **ona binaən**.

**BİNAGÜZARLIQ** *is.* [*fars.*] 1. Tədbir, sərəncam, çarə, çıxış yolu. *Bu xüsusda bir binagüzarlıq lazımdır.* – [Mirzə İsmayıl:] *Rəcəb kəndxuda, binagüzarlıq səninlədir.* Ə.Haqverdiyev.

2. Rəsmi tapşırıq, əmr, qərar, qanun, sərəncam. ☐ **Binagüzarlıq etmək** – 1) tədbir görmək, çarə etmək, çıxış yolu tapmaq. [Divanbəyi:] *Ey, Kamalov, mən gərək yur-*

*dumuza qayıdıb, quldurları axtarmaq üçün binagüzarlıq edəm.* M.F.Axundzadə. *Bu işə təcili binagüzarlıq etmək üçün çalışmaq yoldaş Cəmilə tapşırılır...* Mir Cəlal; 2) qanun vermək, qərar çıxartmaq; // tapşırıq vermək, sərəncam vermək. *İstənilən qüvvənin tezliklə göndərilməsinə binagüzarlıq edəsiniz.* M.S.Ordubadi. *Artırmanın qabağında binagüzarlıq edən yüzbaşı hərdən ağasına dadlı bir təbəssümlə müraciət edir.* Çəmənzəminli. *Qoy Kruçininə pərdəni açmaq üçün binagüzarlıq eləsin.* S.Rəhman.

**BİNAMUS** *sif.* [*fars.* bi... və *ər.* namus] Namussuz. [Bəkir:] *Sizin kimi qəhrəmanın qabağında ölmək yaxşıdır, nəinki binamus, namərd adamların üzünü görmək.* N.Vəzirov. [Sərtib:] *Atamın qanını unutmaq üçün mən gərək bişərəf və binamus bir adam olam.* M.İbrahimov. *Silahı qorumayan binamusdur, yassardır.* R.Rza.

**BİNAMUSLUQ** *is.* Namussuzluq.

**BİNƏ** *is.* 1. Köçərilərin mal-qara ilə köçüb, kənddən kənarda məskən saldıqları yer; yurd, köç. *Qaya çobanın yaşadığı kiçik binə böyüməyə başlayıb, bir kənd şəklinə düşür.* M.S.Ordubadi. *Pası yaylaqdan kəndin yanındakı binəyə enmişdi.* S.Rəhimov. *Sadıq kişi Kürün o tayındakı binəyə getməli oldu.* M.Hüseyn.

2. *dan.* b a x **bina.** *Fəhlələr yer qazar, evin binəsini qoyar, usta taraz ilə ölçər, kəndir uzadar, başlayıb divarı qaldırardı.* Mir Cəlal. *Yarğan yarar sinəsini dağların; Sular ovar binəsini dağların.* R.Rza.

3. *məh.* Ov quşunun gizləndiyi, sığındığı yer.

**BİNƏKDAR** *is.* Keçmişdə: topdan külli miqdarda tay ilə mal satan tacir.

**BİNƏKDARLIQ** *is. köhn.* Binəkdarın işi, sənəti.

**BİNƏLƏNMƏK** *f.* Yurd salmaq, bir yerdə məskən salmaq, möhkəmlənmək; yerini möhkəmlətmək. *Sən orada lap, deyəsən, binələnmisən! – Düşmən səflərini vurub yıxdınız; Faşist səngərində binələnmədi.* R.Rza.

**BİNƏLƏŞMƏK** b a x **binələnmək.**

**BİNƏLİ** *sif. dan.* 1. Bir yerdə yurd salmış, çoxdan sakin olmuş; həmişəlik, daimi.

2. *məc.* Əsaslı, möhkəm, etibarlı.

**BİNƏSİB** *sif.* [*fars.* bi... və *ər.* nəsib] Nəsibsiz, məhrum. ☐ **Binəsib qoymaq (etmək)** – məhrum etmək. *Axırda bu fikirlər məni qurulmaqda olan bu gözəl həyatdan binəsib qoyacaqdır.* Ə.Vəliyev. **Binəsib olmaq** – məhrum olmaq. *Cami-meyi-eşqdən daim olur binəsib; Olmaya ta aşiqin məşqi ruxi-dilbəri.* Nəbati. *Köhnə və yeni kulturadan binəsib olan Aslan bəy, həyatı yalnız əyyaşlıqdan ibarət bilirdi.* A.Şaiq.

**BİNƏVA** *sif.* [*fars.*] Yazıq, fağır, bədbəxt, zavallı, nəsibsiz. *Bunca cəfalərin görüb ol binəva könül; Ol bivəfayə, gör yenə ümmidvar olur.* S.Ə.Şirvani. *Binəva kişi belə fikir edirdi ki, bəli, mənim oğlum oxuyub böyük yaranal olub gələcək.* Ə.Haqverdiyev. *..Uşaqlar da özlərini saxlaya bilmədilər və binəva, ölmüş ananın qəbrinə göz yaşları tökülməyə başladı.* Ə.Əbülhəsən. ☐ **Binəva olmaq** – yazıq olmaq, binəsib olmaq, bədbəxt olmaq. *Sənsiz olmuşam zarü binəva; Hicr düşkünü, rindü mübtəla.* Nəbati; // İs. mənasında. *Rəhm et məni-zarü binəvayə; Dərdi-dilimi yetir dəvayə.* Füzuli. *Sübhədək binəva çəkər zəhmət; Kəndi övladına verər rahət.* M.Ə.Sabir. [Pristav:] *Bu kasıb bədbəxtin öküzünü aparıbsan; binəvanı əli qoynunda qoyubsan.* Ə.Haqverdiyev.

**BİNƏVALIQ** *is.* Yazıqlıq, bədbəxtlik, nəsibsizlik, yoxsulluq. *Ərz eylədi zəfü binəvalıq; Ev-ev gəzib eylədi gədalıq.* Füzuli.

**BİNƏZİR** *sif.* [*fars.* bi... və *ər.* nəzir] Misilsiz, tayı-bərabəri olmayan. [Əzra Zəhraya:] *Bir baban var, cahana şöhrətdir; Fazili-binəzir, Şeyx Kəbir.* H.Cavid.

**BİNİHAYƏ(T)** *sif.* [*fars.* bi... və *ər.* nihayət] Nəhayətsiz, sonsuz, hədsiz, olduqca çox. [Mənsur:] *Məni əbədilik olaraq, bəla dəryasının girdabi-binihayəsinə salıb, cavan ömrümü .. məzara yerləşdirmə.* C.Cabbarlı. [Vaqif:] *Xanın binihayə xəzinəsi və sursat anbarları böyük bir qoşunun öhdəsindən gələ bilər.* Çəmənzəminli.

**BİNİŞAN** *sif.* [*fars.*] Nişansız, əlamətsiz; itkin, gizli. *Bəzi qövm və tayfalar* [ağız ədəbiyyatından] *savayı, özgə bir asar-əlamət zahir etməyib, öz nağıl və hekayələri və milli nağmələri və məsəlləri ilə bir müddət dün-*

*yada ömr edib, sonradan binişan puç və zaye olub gediblər.* F.Köçərli. // Naməlum, yeri bəlli olmayan.

**BİNİYAZ** *sif.* [*fars.*] Ehtiyacsız, ehtiyacı olmayan, möhtac olmayan.

**BİNİZAM** *sif.* [*fars.* bi... və *ər.* nizam] Nizamsız. *Bu evdə üç-dörd qulluqçu var, .. amma onunla belə yenə bir belə binizam ev olmaz.* N.Vəzirov.

**BİNÖQSAN** *sif.* [*fars.* bi... və *ər.* nöqsan] Nöqsansız, nöqsanı olmayan, eyibsiz.

**BİNT** *is.* [*alm.*] *tib.* Tənzifdən hazırlanmış çeşidli endə sarğı. *Yaranı bint ilə sarımaq.*

**BİNTLƏMƏ** "Bintləmək"dən *f.is.*

**BİNTLƏMƏK** *f.* Bint ilə sarımaq, bağlamaq; tənzifləmək. *Yaranı bintləmək.*

**BİNTLƏNMƏ** "Bintlənmək"dən *f.is.*

**BİNTLƏNMƏK** *məch.* Bint ilə sarınmaq, bağlanmaq.

**BİNTLİ** *sif.* Bintlə sarınmış, tənziflənmiş.

**bio...** [*yun.*] Mürəkkəb sözlərdə: həmin sözlərin həyata, həyat proseslərinə, biologiyaya aid olduğunu göstərən birinci tərkib hissəsi; məs.: bioqrafiya, biologiya, biokimya və s.

**BİOCOĞRÁFİYA** [*yun.*] Yer üzündə heyvan və bitki orqanizmlərinin təbii şəraitdən asılı olaraq yayılmasından və qruplaşmasından bəhs edən elm; bioloji coğrafiya.

**BİOFÍZİKA** *is.* [*yun.*] Biologiyanın, canlı orqanizmlərdəki fiziki qanunauyğunluqları tədqiq edən şöbəsi; bioloji fizika.

**BİOKİMYA** [*yun.* bio... və *ər.* kimya] Canlı materiyaya xas olan kimyəvi hadisələri öyrənən elm; bioloji kimya.

**BİOKİMYƏVİ** *sif.* Biokimyaya aid olan. *Biokimyəvi proses. – Bitkinin həyatında alkaloidlərin biokimyəvi rolu haqqında bir çox nəzəriyyələr mövcuddursa da, lakin bu nəzəriyyələr əsaslı dəlillərlə hələ sübut edilməmişdir.* Əliyev.

**BİÓQRAF** [*yun.*] Bir şəxsin tərcümeyi-halını yazan adam.

**BİOQRAFÍK** *sif.* Bir şəxsin tərcümeyi-halına aid olan. *Bioqrafik roman.*

**BİOQRÁFİYA** [*yun.*] Tərcümeyi-hal.

**BİOLÓGİYA** [*yun.*] Canlı cisimlərin həyat və inkişafı qanunlarını tədqiq edən elm.

**BİOLOJÍ** *sif.* Biologiyaya aid və ya xas olan. *Bioloji hadisə. Bioloji elmlər. Bioloji tədqiqat.*

**BİÓLOQ** [*yun.*] Biologiya mütəxəssisi, biologiya ilə məşğul olan alim.

**BİOSFÉR** [*yun.*] Yer üzündə həyatın yayıldığı sahə, dünyanın orqanizmlərlə məskun olan səthi və atmosferin aşağı hissəsi.

**BİOSTÁNSİYA** [*yun.* bio... və *lat.* stansiya] Bioloji stansiya – müəyyən yerdə yaşayan heyvan və bitkilərin biologiyasını tədqiq və bioloji fənlərin tədrisinə yardım edən müəssisə.

**BİPLÁN** [*fr.*] Qanadları üst-üstə yerləşdirilmiş iki qanadlı təyyarə.

**BİR** *say.* 1. 1 rəqəmi ilə işarə olunan sayın adı, miqdar saylarının ilk vahidi. *Üçdən bir çıxmaq. Beşin üstünə bir gəlmək.* // Miqdarca tək. *Bir cilddən ibarət kitab.*

2. *Zərf mənasında.* Bir yerdə, birgə, birlikdə. *Çörəyi bir yedik.*

3. *Sif. mənasında.* Bərabər, eyni. *Bir boyda. Bir həcmdə. Bir böyüklükdə.*

4. Tək, vahid, yeganə, bircə, təkcə. *Onun bir qızı var, bir oğlu. – Aşiqi öldürdü şövq, bir nəzərə çarə yox.* Füzuli. [İkinci qadın:] *Kəndin cavan, qoca qadınları hamısı bir dil, bir ürəklə seçkiyə gedəcəklər.* Ə.Haqverdiyev. *Əhməd ananın bir oğludur.* Mir Cəlal.

5. Ümumi, eyni. *Onların* [iranlıların] *da, bizim də çar hökumətinə qarşı apardığımız mübarizənin məqsədi birdir.* M.S.Ordubadi. *Onların dərdi bir olduğu kimi, dərmanı da birdir.* Mir Cəlal.

6. Bir sıra sözlərin qabağında qeyri-müəyyənlik bildirir. *Oradan bir ağac gətir. Sizi bir adam görmək istəyir. Bu gün bizə bir adam telefon eləmişdi. Məni bir şey narahat edir.* – [Namaz:] *Bir beş adamın içində də təşəxxüslə özünü çəkib deyərsən ki, mən Cahangir ağanın qayınatasıyam.* Ə.Haqverdiyev. *On-on iki nəfərdən ibarət bir dəstə düz onlara sarı gəlirdi.* M.Hüseyn.

7. Feillərin qabağında təkid, israr, lüzum bildirir. *Sən bir dayan! Sən bir gözlə! Bir gedək, görək necə oldu. Bir oxu, görək nə yazılıb. – Mən arzu eləyirəm ki, müsəlman qardaşlar kənarda bir şeyi görəndə və o şeyi bilməyəndə bir dayanıb soruşalar ki, bu*

*nədir?* C.Məmmədquluzadə. [Mübaşir:] *Sən Allah, bir de görüm, belə qızı kimin üçün bəsləmisən?* M.İbrahimov. [Surxay:] *Axı bir iltifat elə!* İ.Əfəndiyev.

8. "Heç" mənasında. *...Bir quru daxmadan başqa ataları bunlara bir şey qoymamışdı.* S.S.Axundov. *Yusif kağızı diqqətlə oxuyub dedi: – Mən hərçi fikir edirəm, bir şey çıxmır.* N.Nərimanov.

9. Sifətlə isim arasında, yaxud isimlə xəbər arasında təyinlik dərəcəsini artırır, ya da azaldır. *Gözəl bir mənzərə. Məlahətli bir səs. Uca bir dağ. Kiçik bir iş. Balaca bir vəzifə. – İlin hər fəslinin bir hüsnü var; amma qışın ləzzəti bir özgədir.* C.Məmmədquluzadə. *Aralığa gərgin bir sükut çökdü.* Ə.Məmmədxanlı.

10. Vaxt, zaman bildirən isimlərin əvvəlində zaman zərfi əmələ gətirir. *Bir dəqiqə dayan. Bir gün bilərsən. Bir dəfə sizə gələrəm. – Bir dəqiqədə arvad-uşaq gəlinin başına toplandılar.* Çəmənzəminli.

11. Zaman bildirən sözlərlə iş və ya hərəkətin təkrarını bildirir. *Hər on-on iki gündən bir Bəşirdən məktub alırdım.* S.S.Axundov. *Fərman saatda bir bazara qaçıb, lazım olandan alıb qayıdırdı.* Ə.Haqverdiyev.

12. Feillərin qabağında hərəkətin təsirini şiddətləndirir. *İt qurdu görən kimi, bir qaçış qaçdı ki. – Cavanşir qabağındakı oğlana möhkəm bir zərbə endirərək, onun qalxanını yarıya böldü.* M.Hüseyn.

13. Tərəf, yan, cəhət kimi sözlərin əvvəlinə gətirildikdə bölgü məzmunu ifadə edir. *Bir yandan mən, bir yandan sən. Bir tərəf razıdır, o biri tərəf yox. – Yoxsa, mən bir yandan deyim ki, qanuni-əsasi çox yaxşı şeydir.* C.Məmmədquluzadə.

14. "Oldu" sözü ilə bərabər – iki iş, ya hadisənin sürətinin aniliyini, eyni zamanda baş verdiyini bildirir. *Gəlməyi ilə getməyi bir oldu. – Vaqif əlini atdığı ilə üzüyü çıxartdığı bir oldu.* Çəmənzəminli. *Yerindən sıçramaqla pəncərəyə atılmağım bir oldu.* Ə.Məmmədxanlı.

◊ **Bir ağızdan** – hamı birdən, səs-səsə verərək, xor ilə. *Bir ağızdan dedilər: "Dan yeri, dan ulduzu!" Sordum: bundan gözəli yoxmu parlayanların?* M.Müşfiq. *Bir anda göyərtənin altındakı kürəkçilər də, üstündəki igidlər də bu səsə səs verib bir ağızdan bağırışdılar...* M.Rzaquluzadə. **Bir aləm** – çoxlu, hədsiz. *Bir aləm işim var.* **Bir an** – bir ləhzə, bir saniyə. [Şeyx:] *Onu gözünüzdən qoymayın bir an.* S.Vurğun. **Bir anda** – dərhal, bir ləhzədə, göz yumub açınca. **Bir anlıq, bir anlığa** – çox az müddətdə, çox qısa bir zaman üçün, bir ləhzəlik. *Ağrısını unutmuşdur bir anlığa yaralar.* S.Vurğun. *Sən də bir anlığa düşüncəyə daldın.* İ.Əfəndiyev. **Bir ara(lıq)** – bir zaman, bir vaxt, bir müddət. **Bir arada** – bir yerdə, birlikdə. **Bir az** – 1) azacıq, azca, az miqdarda, müxtəsər. *Bir az kağız ver. – Söz verirsən ki, sabah gələsən bir az söhbət edək?* C.Məmmədquluzadə; 2) bir qədər, azacıq zaman. *Bir az gözlə. Bir az dayan.* – [Babaxan:] *Yoldaş, necə yəni "bir az sonra gəl?"* Mir Cəlal. **Bir azca** – b a x **bir az. Bir azdan** – tezliklə, çox keçmədən, azacıq sonra. *Bir azdan gələrəm. – Bir azdan .. qayalıqların başı qıpqırmızı işığa qərq oldu.* S.Rəhman. **Bir balaca** – b a x **bir az.** *Bir balaca səbr elə.* **Bir barmaq** – bir az, çox kiçik, barmaq qədər kiçik. *Bir barmaq boyu var.* – [Bünyad:] *Nə olardı ki, bir barmaq kağız qoyaydılar ki, pəs hələ-həlbət durmayıb gələsən.* Ə.Əbülhəsən. **Bir cür olmaq** – b a x **birtəhər olmaq**. **Bir çox** – 1) çox, bir sıra, xeyli, müxtəlif. *Bir çox adam. Bir çox şey;* 2) uzun-uzadı, uzun sürən. *Bir çox danışıqdan sonra. Təklif bir çox mübahisəyə səbəb oldu.* **Bir daha** – 1) bir dəfə də, yenə də, təkrar. *Azərbaycanlılar Midiya dövründə olduğu kimi, bir daha assurilər və kəldanilər vətənində qılınc parlatdılar.* M.S.Ordubadi. [Səriyyə xala və uşaqlar] *bir daha adamların sıxlaşdığı yerlərə yaxın düşmədilər.* M.İbrahimov. *Yolçu bir daha xarabalığı gözdən keçirdi.* Ə.Məmmədxanlı; 2) b a x **bir də** 2-ci mənada. **Bir də** – 1) bir daha; 2) bundan sonra, daha, artıq. *Bir də belə şeylər etmə. Bir də buralara ayaq basma*; 3) əlavə, başqa, üstəlik. *Bir də kim gəldi? Bir də sən get*; 4) gözlənilməzlik bildirir; birdən, gözlənmədən. *Bir də gördüm ki, saat 12-dir. – Bir də gördüm .. səyahətçi libasında bir şəxs durbin ilə qayanın döşündəki*

*köhnə imarətə baxır.* S.S.Axundov. **Bir dəm** – bir ləhzə, bir dəqiqə. *Eşqin bəni bəlasız bir dəm qoymaz əlindən.* Nəsimi. **Bir dənə** – ancaq tək, misilsiz, tayı olmayan. *Ondan bir dənədir.* **Bir dünya** – b a x **bir aləm. Bir dürlü –** 1) bir növ, bir cür; 2) heç bir vəchlə, heç bir vasitə ilə. [Dursun] *sözündən dönməyi bir dürlü mənliyinə sığışdıra bilməyirdi.* A.Şaiq. *Levin bu sözlərin mənasını bir dürlü anlaya bilmədi.* M.Hüseyn. **Bir e(y)ləmək** – birləşdirmək, uyğunlaşdırmaq, eyniləşdirmək. *Sadiq oldur, dilini könlü ilə bir eyləyə; Əgridildən nəğmə gəlməz, durmuşam inkarına.* Nəsimi. **Bir əl** – bir dəfə, bir kərə, bir dövrə. *Bir əl nərd oynamaq.* – [Atabəy Qızıl Arslana:] – *Gəl otur, bir əl şahmat oynayaq,* – [dedi]. M.S.Ordubadi. **Bir ətək** – çoxlu, külli miqdarda. *Bax, bunlara mən bir ətək pul vermişəm.* A.Şaiq. *Vallah, özgə millətdə olsa, beləsinin saatına bir ətək qızıl verərdilər.* Mir Cəlal. **Bir gunə** *köhn.* – bir növ, bir cür. [Nadir] *..Əşrəfi basmaqda bir gunə hünər və fərasət göstəribdir.* M.F.Axundzadə. *Xərab olmadı bir gunə dil fəraqından; Ki, eyləyə bilə memari-vəsl onu islah.* S.Ə.Şirvani. **Bir gün** – bir dəfə, günlərin birində, bir vaxt. *Bir gün sizə gələndə, gətirərəm.* **Bir halda ki** – madam ki, iş belə olduğu halda, əgər belə isə. **Bir kərə –** b a x **bir yol**. **Bir kişi** – heç kim, heç kəs. *Tərrar gər alursə qamu rəxti, rəvadır; Çün qafilədə bir kişi bidar bulunmaz*. Nəsimi. **Bir kitab** – çoxlu. [Mürşüd:] *İnci, axı mən evdə sənə bir kitab söz danışdım*. S.Rəhman. **Bir qədər** – bir az, azacıq bir miqdar. *Bir qədər gözlə. Bir qədər yol getdik.* **Bir qisim** – hamısı yox, ancaq bir hissəsi, bir parası, bəziləri. *İclasda iştirak edənlərin bir qismi. Yalnız bir qisim kolloid məhlulların elastik xassələri vardır.* **Bir qucaq** – çox, çoxlu. **Bir qulaq** – bir az, azacıq. *Dur, bu çoşkanı bir də götür, buradan rədd ol, daha qoymaz bir qulaq yataq.* S.Rəhimov. **Bir neçə** – azacıq miqdarda, bir az, cüzi. *Bir neçə adam.* **Bir növ** – b a x **birsayaq, birtəhər** 1-ci mənada. *Şəban gedib, qızdan təvəqqe etdi ki, onu bir növ Məşədi Məmmədvəli ilə barışdırsın.* Ə.Haqverdiyev. *Kosa tərəzini tədricən qaldırdı, bir növ tərəzi düzəlişdi.* S.Rəhimov. **Bir o qədər –** 1) o dərəcədə. *Torpaq nə qədər yaxşı becərilsə, bir o qədər çoxlu məhsul verər*; 2) o qədər çox. *Uşaqlar kiçik olduqlarından, analarına bir o qədər köməkləri çatmırdı.* S.S.Axundov. **Bir olmaq** – birləşmək, müttəfiq olmaq, həmrəy olmaq. *Yar ilə çünki bir oldi Nəsimi; Nə ğəm, gər cümlə aləm olsa əğyar.* Nəsimi. **Bir ovuc** – çox az, bir az, cüzi miqdar. *Bir ovuc adam.* **Bir para** – 1) bəzi. *Nə özün yarıdır, nə sevənləri; Bir para adamı kərkəvaz eylər.* M.P.Vaqif. [Səkinə xanım:] *Bəs ona sən necə bir para zad təlim edərsən?* M.F.Axundzadə. *Bir para yoldaşlarımla vaqona minib vətənə üz qoyduq..* S.S.Axundov; 2) bir az, bir qədər; bəzən. *Acı söz yaraşmaz belə bazara; Şirin-şirin gəl danışaq bir para.* Q.Zakir. **Bir parası** – hamısı yox, bir hissəsi, bir qismi. *Əhalinin bir parası qətlə yetişib, yerdə qalanı da qaçıb dağlarda, meşələrdə gizlənmişdi.* S.S.Axundov. **Bir parça, bir tikə** – bir az, azacıq, azca. **Bir sıra** – bir miqdar, bəzi. *Bir sıra yoldaşlar. Bir sıra hallarda. Bir sıra hadisə baş verdi. Bir sıra təsərrüfat sahələri*. **Bir sözlə** – danışılan söhbətə, söylənilən fikrə yekun vurmaq üçün ara söz kimi işlənilir; xülasə, müxtəsər. *Bir sözlə, molla Qasım Güllücə kəndini inək kimi sağıb yeyirdi.* S.S.Axundov. **Bir sözünü iki eləməmək** – sözünün qabağında söz deməmək, razılaşmaq, etiraz etməmək. [Musa] *məktəb uşaqlarının bir sözünü iki eləməzdi.* Mir Cəlal. **Bir şey** – məlum olmayan, qeyri-müəyyən, anlaşılmayan bir hadisə, keyfiyyət və s. *Bu barədə bir şey bilirsənmi? O mənə nə isə bir şey demək istəyirdi.* **Bir tövr** – b a x **birsayaq, birtəhər.** *Gülsüm ağlamaqdan* [o qədər] *bitab olmuşdu ki, yolu gedə bilmirdi. Axırda qoltuğuna girib bir tövr evə gətirdilər.* Ə.Haqverdiyev. **Bir ucdan** – bir başdan, bir tərəfdən, bir yandan. *Zərgər .. bir ucdan oğurlar, bir ucdan satar.* Q.Zakir. **Bir vaxt** – 1) vaxtilə, bir zaman, keçmişdə, əvvəllər. *Bir vaxt onun yaxşı səsi var idi. Bir vaxt var idi ki, teatrlarımızda qadın rolunu kişilər oynayırdı;* 2) gələcəkdə, qeyri-müəyyən bir vaxtda. **Bir yerdə** – bərabər, müştərək,

başqası ilə birlikdə. *Bir yerdə yeyib-içmək. Bir yerdə gəzmək.* – [Tubu:] *Ay qız, atanla bir yerdə şəhərə gedənlər hamısı qayıtdılar, indicə atan da gələcək.* Ə.Haqverdiyev. **Bir yığın** – çoxlu, külli miqdarda. *Cavan oğlan birinci otaqda əyləşib, qabağındakı bir yığın kağızları birbəbir oxuyub, dəftərə yazırdı.* Ə.Haqverdiyev. **Bir yol** – bir dəfə, bir kərə. [Gülpəri:] *Ay xala, bir yol dedin, eşitdik, dilotu yeməmisən ki?* M.Hüseyn. [Tahir:] *Neçə həftədir, bir yol da cərimə verməmişəm.* M.Hüseyn. **Bir-birinə dəymək** – ara qarışmaq, həyəcan düşmək, hamı təlaşa düşmək. **Bir-iki(cə)** – bir neçə, az (qeyri-müəyyən miqdar). *Bir-iki kitab aldım. Bir-iki adam gəlib. Bir-iki balıq tutduq. – Mahmud bir-ikicə sözlə başına gələnləri bu qarıya dedi.* Ə.Əbülhəsən. **Bir-ikisi** – bir neçəsi, bir neçə nəfəri. [Uşaqların] .. *bir-ikisi də başını divara söykəyib, qulağını pəncərənin deşiyinə yapışdırdı.* B.Talıblı. **Birsayaq, birtəhər** – 1) bir cür, bir növ, bir vasitə ilə. *Qəhrəman qocanı birtəhər dilə tutub ata mindirdi.* S.Rəhimov; 2) tələsik, necə gəldi, başdansovma. *İşi birtəhər görüb qurtardı*; 3) qəribə, qeyri-adi, hamıya oxşamayan, başqalarına oxşamayan. *O, birsayaq* (*birtəhər*) *adamdır.* – [Zərifə:] *Sənin pencəyin niyə birtəhər durur?* S.Rəhimov. **Birtəhər olmaq** – 1) mütəəssir olmaq, əhvalı qarışmaq, halı xarab olmaq, pozulmaq. [Gültəkin:] *Tarın səsini eşitdim, ürəyim birtəhər oldu.* C.Cabbarlı; 2) adi halı dəyişmək, utanan kimi olmaq, həyəcanlanmaq, sıxılmaq. *Bünyadın adı çəkiləndə, Qumru qızarır, onunla danışanda birtəhər olur.* Ə.Əbülhəsən; 3) *dan. zar.* ölmək, aradan çıxmaq və s. **Elə bir** – keyfiyyətin dərəcəsini gücləndirmək, şiddətləndirmək üçün işlənir. *Elə bir halə düşərsən ki, tükün biz-biz olar.* M.Ə.Sabir. [Əsgər:] *Üzünə demirəm, elə bir oğul böyüdən anaya əhsən olsun.* Mir Cəlal. **Heç bir** – b a x **heç.**

**bir...** Mürəkkəb sözlərin birinci tərkib hissəsi; məs.: birgünlük, birsaatlıq, birtərəfli, birəlli və i.a.

**BİRADAMLIQ** *sif.* Bir adam üçün, yalnız bir nəfər üçün olan. *Biradamlıq yer. – Yenicə şəhərdən gətirilmiş nazik, biradamlıq çarpayılar, kürsülər iki cərgə düzülmüşdü.* Mir Cəlal.

**BİRADLI** *sif.* Adları bir olan, eyni ada malik olan. *Biradlı şeylər. Biradlı kəmiyyət.*

**BİRAİLƏLİ** *sif.* Bir ailə üzvləri kimi, çox yaxın.

**BİRAİLƏLİK** *is.* Çox yaxınlıq.

**BİRATIM(LIQ)** *sif.* Yalnız bir dəfəyə kifayət edən. *Biratımlıq çay. Biratımlıq barıt.* ◊ **Biratım(lıq) barıtı var** – çox tez həvəslənən, ruhlanan, lakin işi axıra çatdırmağa hövsələsi çatmayan, işdən tez soyuyan adam haqqında.

**BİRATLI** *sif.* Bir at qoşulan. *Biratlı araba.*

**BİRATOMLU** *sif.* Tərkibi bir atomdan ibarət olan.

**BİRAYAQLI** *sif.* Bir ayağı olan, birqıçlı; ayağının biri kəsilmiş, qırılmış.

**BİRAYLIQ** *sif.* 1. Bir ay davam edən, bir ay müddəti üçün nəzərdə tutulmuş. *Biraylıq müddət. Biraylıq maaş. Biraylıq məzuniyyət. Biraylıq iş planı.*

2. Ömrü bir ay olan. *Biraylıq uşaq.*

**BİRBARMAQLI** *sif.* Əlində tək bir barmaq olan.

**BİRBAŞ(A)** *zərf* Arada heç bir yerdə durmadan, bilavasitə, düz. *Elə uçurum, sıldırım qayalıq yerlərdən keçirdim ki, ayağımın altından bir daş uçsa idi, birbaş dərəyə yuvarlanıb parça-parça olacaqdım.* A.Şaiq. *Yazıq muzdur qolu boynunda sınıqçıdan qayıdıb, birbaşa öz xozeyninin yanına gəldi.* S.M.Qənizadə. [İlyas] *birbaş dağlara qaçmaq, Afaqı tapmaq, onu görmək .. istədi.* Ə.Məmmədxanlı. // Birnəfəsə, arası kəsilmədən, durmadan. *Birbaşa etdiyi söhbət Həsən ağanı yorduğundan, o dayanıb nəfəsini dərdi.* M.S.Ordubadi.

**BİRBƏBİR** b a x **bir-bir**. *Cövrlər kim eyləmişdin, birbəbir yad eyləyib; Şami-hicran könlümü bu növ ilə şad eylərəm.* S.Ə.Şirvani. *Qarovul malları xurcundan çıxardaraq, birbəbir təftiş edib yerə atdıqca, Əhmədin ürəyinə guya ki, zəhərli ox sancırdı.* B.Talıblı. *Ömrün əziz günləri birbəbir yada gəldi.* S.Rüstəm.

**BİR-BİR** *zərf* 1. Tək-tək, ayrı-ayrılıqda. [Süleyman:] *De, bir-bir söylə, qulaq asım.* Ü.Hacıbəyov. *Anası da oğlu qazan yollara*

*bir-bir bələd oldu.* Ə.Haqverdiyev. *Konsul onları* [siyahıları] *bir-bir alıb, öz katibinə verir...* M.S.Ordubadi.

2. Bir-birinin ardınca, ardıcıl surətdə, növbə ilə. *Totuq gəlinlər bir-bir oynadılar, göyçək qızlar süzdülər.* Çəmənzəminli. [Hakim] *stolunun üstündə gördüyü lazımsız kağızları bir-bir cırıb, səbətə atırdı.* Mir Cəlal.

3. Təfsilatı ilə, təfərrüatına qədər, hər biri ayrı olaraq. *Gördüyü işləri bir-bir saydı. Nöqsanları bir-bir göstərmək. – Əcnəbinin bu sözlərini Sədrəddin bəy qapı dalısında bir-bir yazırdı.* S.M.Qənizadə. *Rüstəm komandirə bu ətrafdan bir-bir, yerbəyer danışır.* S.Rəhimov.

4. Hərəyə bir, hər dəfədə bir. *Bir-bir vermək. Bir-bir paylamaq.*

**bir-bir...** Müxtəlif hal şəkilçiləri ilə: **bir-biri ilə, bir-birinə, bir-birindən, bir-birini** – qarşılıq bildirir. *İtlərin hürməyi, ovçuların səsləri, nökər və mehtərlərin qışqırığı bir-birinə qarışmışdı.* S.S.Axundov. [Firidun və Kürd Əhməd] *mehriban bir nəzərlə bir-birinə baxdılar.* M.İbrahimov. [Gülüşgəlin:] *İki kişi bir-birinizə havadar olun.* S.Rəhman. *Bir-birini haylayan arvad-uşaq səsi kəndi ağzına almışdı.* Ə.Əbülhəsən.

◊ **Bir-birinə dəymək (qarışmaq)** – qarışıqlıq düşmək, çaxnaşma düşmək, həyəcan düşmək, ara qarışmaq. *Dünya yenə bir-birinə dəydi.* – C.Məmmədquluzadə. *İyirminci il baharının günəşli bir səhərində qəza mərkəzi kiçik şəhər bir-birinə dəydi.* H.Nəzərli. *Seçkilərin nəticəsində məlum oldu ki, .. Tükəzban xala kənd şurasına sədr seçilibdir. Kəndə böyük vəlvələ düşdü, camaat bir-birinə dəydi.* B.Talıblı. **Bir-birinə vurmaq** – çox axtarmaq. [Müəllim] *kəndi bir-birinə vurdu, axırda bir körpə əmlik tapdı.* Ə.Vəliyev.

**BİRBUĞUMLU** *sif. zool. bot.* Bir buğumu olan.

**BİRBUYNUZLU** *sif. zool.* Bir buynuzu olan, təkbuynuzlu, taybuynuz. *Birbuynuzlu cücü. Birbuynuzlu kərgədan.*

**BİRCƏ** 1. *say.* Yalnız bir, tək bir, yalnızca, təkcə, yeganə, vahid. *Onun bircə uşağı var. Bircə gün bu işə bəsdir. Bircə saat gözlə. – Güllə Əlinin tüfəngini saldı yerə. Nəbigildə bircə tüfəng qaldı.* "Qaçaq Nəbi". *Biçarə həkim börkünü götürüb bircə dəfə "xoroşo" deyib çıxıb getdi.* C.Məmmədquluzadə. [Mehrixanım:] *Sən mənim bircə balamsan!* Ə.Haqverdiyev. // Ancaq, yalnız. [Nəbi kişi:] *Cərgədən çıxmaq bircə öləndə, hələ ona da baxarıq.* S.Rəhimov. [Qadın:] *Anası ölmüşlərdən çoxdandır kağız yoxdur. Bircə böyüyündən gəlib..* M.Hüseyn. // Heç olmasa, heç olmasa bir. *Bəlkə düşə bircə qaranquş ələ; Ta yeyibən loğmanı canə gələ.* S.Ə.Şirvani. *Keçən günü bircə salsan yadına; Dostu atmaq layiq deyil adına.* Aşıq Kərəm.

2. *əd.* Arzu bildirir. *Bircə gələydi. Bircə görsəydim. – İncimərəm sənin şirin felindən; Əhdim budur bircə qucum belindən.* (Qoşma). [Pəri xanım:] *Ay Sona! Neçə vaxtdır ha yığışıram bircə səni görməyə gəlim. Amma görürsən, iş düşür.* Ə.Haqverdiyev.

3. *əd.* Hədə, təhdid bildirir. *Bircə bura gəl, gör sənə nə edərəm.*

4. *əd.* Təkid, xahiş bildirir. [Tubu:] *Bircə de görüm Aslanın işi hancarı oldu?* Ə.Haqverdiyev. [Əminə:] *Bircə fərağat dur, .. göz dəyər sana!* S.Vurğun. [Əsəd] – *Bircə buradan bax, – deyə Mahmud əmiyə təklif etdi və qolundan yapışıb dartmaq istədi.* B.Talıblı.

**BİRCƏ-BİRCƏ** *zərf* b a x **bir-bir.**

**BİRCƏCİK** "Bircə" *söz. kiç.*

**BİRCƏCİYƏZ** b a x **birciyəz.**

**BİRCƏRGƏLİ** *sif. k.t.* Bir cərgədə əkilmiş, bir sırada düzülmüş. *Bircərgəli əkin.*

**BİRCƏRGƏLİLİK** *is.* Bir cərgədən ibarət olma, bir cərgədə əkilmə.

**BİRCİLDLİ** *sif.* Bir clddən ibarət olan. *Bircildli lüğət. Bircildli kitab.*

**BİRCİLDLİK** 1. B a x **bircildli.**

2. *is.* Bir clddən ibarət kitab.

**BİRCİNS** *sif.* Cinsi bir olan, eyni cinsdən olan. *Bircins meyvə.*

**BİRCİNSİYYƏTLİ** *sif. biol.* Yalnız bir (ya erkək, ya dişi) cinsiyyət üzvünə malik olan (bitkilər haqqında).

**BİRCİNSİYYƏTLİLİK** *is. bot.* Yalnız bir cinsiyyət üzvünə malik olma; bircinsiyyətli olma xassəsi.

**BİRCİNSLİ** b a x **bircins.**

**BİRCİNSLİLİK** *is.* Eyni cinsdən olan şeylərin halı, xassəsi.

**BİRCİYƏZ** "Bircə" *söz.* (1-ci mənada) *oxş.* [İskəndər:] [Atasının] .. *dişinin, heç birciyəzi də zədələnməmişdi.* M.Hüseyn.

**BİRCÜR(Ə)** *sif.* 1. Bir qaydada, bir şəkildə, bir tərzdə, bir tipdə olan. *Bircür mal. Bircür rəng.*

2. Başqalarına bənzəməyən, adi normadan kənar. *O bircür*(*ə*) *adamdır.*

**BİRCÜRƏLİK** *is.* Sifətcə, keyfiyyətcə, şəkilcə və s. cəhətdən bir olma; eyni şəkildə olan şeyin halı.

**BİRÇƏK** *is.* 1. Qulaqların üstündən çıxan saçın qövs şəkilli hissəsi (qadınlarda). *Qaşın qabağında seyqəlli birçək; Sayə salmış üzə şölə mübarək.* M.P.Vaqif.

2. Ümumiyyətlə saç. [Səfər] *birçəklərini qotaz daramazdı, papiros çəkməzdi, aşurada başını yarmazdı, qaməti də mövzun deyildi.* Ə.Haqverdiyev. *Xan .. Zamanın birçəklərindən yapışıb ayağının altına saldı.* Çəmənzəminli. *Tarixlərin şahididir mənim bu ağ birçəyim.* S.Vurğun.

3. Atın yalından ayrılıb, alnına tökülən tük dəstəsi. *At birçəyi.*

◊ **Birçəyi ağ** – qoca. *Tezliklə Azad da qayıdar, .. evləndirərsən, sən də birçəyinin ağ vaxtında bir gün görərsən.* M.İbrahimov. **Birçəyi ağarmaq** – qocalmaq (yalnız qadın haqqında). **Birçəyini ağartmaq** – 1) qocalmaq; 2) qocaltmaq, qocalmasına səbəb olmaq. [Sona xanım:] [Heydər bəyin] *fikri budur ki, atam evində mənim birçəyimi ağarda.* M.F.Axundzadə.

**BİRÇƏKLƏMƏ** "Birçəkləmək"dən *f.is.* *Bazarda bəzzazın tərəkəməyə min and ilə şey satmağı, hambalların birçəkləmə davası, baqqalların ağız-ağıza verib, qatığa müştəri axtarmaları – heç biri onun zahir və batinində səbəbi-təğyir ola bilməzdi.* Çəmənzəminli.

**BİRÇƏKLƏMƏK** *f.* Savaşarkən birçəyindən, saçlarından yapışmaq.

**BİRÇƏKLƏŞMƏ** "Birçəkləşmək"dən *f.is.*

**BİRÇƏKLƏŞMƏK** *qarş.* Bir-birinin birçəyindən yapışmaq, bir-birinin saçını yolmaq; savaşmaq.

**BİRÇƏKLİ** *sif.* Birçəyi olan. *Birçəkli qadın. – Məşədibəyin ilk zərbəsindən uzunbığlı, sallaq birçəkli bir sərkərdənin başı qələm kimi atıldı.* Çəmənzəminli. [Cahılların] *bir parasında başmaq, bir parasında da cığ-cığ çəkmə, bir qismi kəkilli, bir qismi isə birçəkli, xətbaşılı olardı.* H.Sarabski.

**BİRÇƏKLİK** *is. köhn. dan.* Birçəyə (saça) taxılan zinət.

**BİRÇƏKSİZ** *sif.* Birçəyi olmayan.

**BİRDƏFƏLİK** 1. *sif.* Yalnız bir dəfə olan. *Birdəfəlik maddi yardım. Birdəfəlik vergi.*

2. *zərf* Həmişəlik, qəti. *Birdəfəlik rədd etmək. Birdəfəlik başa sal. Birdəfəlik yaxasından əl çəkdi.* – [Məhərrəm bəy:] *Xülasə, birdəfəlik səni vəkil edirəm, nə tövr istəyirsən, elə et.* S.S.Axundov. *Qabarlı əllər uzanır "Zimni"yə; Köhnə dünyanı birdəfəlik boğmaq üçün.* R.Rza.

**BİRDƏN** *zərf* 1. Gözlənmədən, qəflətən, qəfildən, nagah. *Birdən yıxılmaq. Birdən qulağıma bir səs dəydi. Birdən dili tutulmaq. – ..Yazırsan ki, istəyirəm bir işə əl vuram, birdən məni gərnəşmə tutur.* C.Məmmədquluzadə. *Məşədi Əsgər getmək istəyəndə, Həsənəli bəyin sözü birdən yadına düşdü.* S.M.Qənizadə. *Birdən tingə başından .. bir dəstə qız onun qarşısına çıxdı.* Ə.Məmmədxanlı.

2. Bir dəfədə, bir dəfəyə. *Bir stəkan suyu birdən içdi.* // Eyni zamanda, bir vaxtda. *Hamı birdən oxudu. Hamınız birdən danışmayın. – Ey bivəfa, məni cana yetirdin; Munca cövrü cəfa birdən olurmu?* Q.Zakir.

◊ **Birdən-ikiyə** – heç. [Badam xala:] *..Məni birdən-ikiyə iclasda görmüsən?* Mir Cəlal. *Mən birdən-ikiyə danışmamışam.* Ə.Sadıq.

**BİRDƏN-BİRƏ** bax **birdən** 1-ci mənada. *Birdən-birə göründü gözə bir xərabəzar.* M.Hadi. *Bu aralıq birdən-birə toyuğumu xatırlayıb, cəld hinin ağzına yüyürdüm.* A.Şaiq. *Birdən-birə harada isə uzaqlarda, qaranlıqda almaz kimi bir şey işıldayıb çəkildi.* M.İbrahimov.

**BİRDƏSTƏKLİ** *sif.* Bir dəstəsi, bir əltutanı olan. *Birdəstəkli mişar.*

**BİRDİBLİ** *zərf* Həmişəlik, qəti, birkərəlik. [Feyzi:] *İndi ki belədir, deyirəm, elə birdibli boşan, get!..* Ə.Haqverdiyev. [Kazım:] *– Eh, cəhənnəmə ki!.. Budur şah gəldi, odur şah gəldi, daha qulağımız dolubdur, – dedi. – Gəlir gəlsin. Mus-mus deyincə, birdibli Mustafa deyib canımızı alsın, qurtarsın...* Çəmənzəminli.

**BİRDİRSƏKLİ** *sif.* Bir dirsəyi olan. *Birdirsəkli boru.*

**BİRDORLU** *sif.* Bir doru olan. *Birdorlu gəmi.*

**BİREVCİKLİ** *sif. bot.* Eyni nümunədə hər iki cinsli çiçəklərə, həm dişiciklərə, həm də erkəkciklərə malik olan. *Birevcikli bitkilər.*

**BİREVCİKLİK** *is. bot.* Bəzi bitkilərdə: eyni nümunədə hər iki cinsli çiçəklərin, həm dişiciklərin, həm də erkəkciklərin olması.

**BİREVLİ** *sif.* Çox yaxın, bir ailə kimi mehriban (adətən "kimi" qoşması ilə). *Birevli kimi yaşamaq. Onlar birevli kimidirlər. – Çünki onlar ilə başdan, binadan; Birevli kimisiz ata-babadan.* Q.Zakir. *Sabah-axşam çayını da Rozanın anası verir, birevli kimi yaşayırıq.* H.Cavid.

**BİREVLİLİK** *is.* Çox yaxınlıq.

**BİRƏ** *is.* İnsan və heyvanları sancıb əziyyət verən çox sıçraq cücü. *Köhnə məscid hücrələrində birə əlindən tərpənmək olmazdı.* H.Sarabski. *Laçın .. tövlələrinə girmək istəyəndə hədsiz-hesabsız birələr onun üstünə daraşdı.* M.Hüseyn.

◊ **Kürkünə birə düşmək** – təşvişə düşmək, qorxuya düşmək.

**birə...** Adətən birə-bir, birə-iki və s. şəklində işlənərək, ikinci rəqəm kəmiyyətin əslində olduğundan neçə dəfə artırıldığını göstərir. [Əsgər bəy:] *On beş günədək Təbrizə gedərik, qayıdarıq, qaçaq mal gətirrik, birə-bir qazanarıq; onun qazancı ilə toyunu edərsən!* M.F.Axundzadə. [Mirzə Dadaş:] *Allah qoysa, mən ondan birə-beş alacağam.* N.Vəzirov. *Hər gün döyüşlərdə vurduq birə-yüz; Dağlara səs salır hücum borusu.* S.Vurğun.

**BİRƏ-BEŞ** *zərf* Beş qat artıq, hər bir ədədə qarşı beş.

**BİRƏ-BİR** *zərf* Hər bir saya qarşı bir, hər bir ədəd üçün bir.

**BİRƏBİTDƏN** *is. zool.* Sərçədən kiçik, torpaq rəngli bir quş.

**BİRƏÇİÇƏYİ** *is. bot.* Mürəkkəbçiçəklilər fəsiləsindən birillik ot bitki və bu bitkinin çiçəyi (bu bitkinin qurudulmuş çiçəklərindən taxtabiti, birə və s. cücülərlə mübarizə üçün dərman tozu hazırlanır).

**BİRƏDƏDLİ** *sif.* Bir ədəddən ibarət olan.

**BİRƏDİ** *zərf dan.* 1. Bütünlüklə, hamısı birdən.

2. Birlikdə, bir yerdə, yoldaşlı.

**BİRƏĞBƏT** *sif.* [*fars.* bi... və *ər.* rəğbət] Eybəcər, rəğbətsiz, çirkin. [Mirzə Süleyman bəy] *..qapıdan girib çıxanda rəhmətlik atasının dalınca bir az deyinirdi və məzəmmət eləyirdi ki, niyə onun adı belə birəğbət imiş?* B.Talıblı.

**BİRƏHM** *sif.* [*fars.* bi... və *ər.* rəhm] Rəhmsiz, amansız, daşürəkli. *Dust bipərva, fələk birəhm, dövran bisükun.* Füzuli.

**BİRƏHMLİK** *is. köhn.* Rəhmsizlik, amansızlıq, daşürəklilik. [Hacı Nuru:] *Görərsiniz ki, o vaxt .. nə işlər sizin balalarınızın başına gətiriblər, nə birəhmlik onlar haqqında ediblər.* M.F.Axundzadə.

**BİRƏ-İKİ** *zərf* Hər bir saya qarşı iki, iki dəfə artıq.

**BİRƏLƏMƏK** *f. dan.* Birə daraşdırmaq, birə ilə doldurmaq, birəli etmək. *Pişik yatdığı yeri bütün birələdi.*

**BİRƏLƏNMƏK** *f. dan.* Bədəninə, paltarına birə daraşmaq. *Tövləyə girib birələndi, çıxdı.*

**BİRƏLİ** *sif.* Birə basmış, birə daraşmış, birə olan.

**BİRƏLLİ**[1] 1. *sif.* Bir əli olmayan, bir əli kəsik olan. *Birəlli adam. Birəlli qalmaq.*

2. *zərf* Tək əli ilə, ancaq bir əli ilə. *Pambığı birəlli yığmaq.*

◊ **Birəlli tutmaq** – əhəmiyyət verməmək, saymamaq, qiymətləndirməmək. *Yoldaşını birəlli tutma.*

**BİRƏLLİ**[2] *is.* Təkqulplu qab, birqulplu su qabı. *Birəllini su ilə doldur.*

**BİRƏM-BİRƏM** bax **birər-birər**. *Pəncərədən o yana birəm-birəm qar gəlir.* R.Rza.

**BİRƏNC** *sif.* [*fars.*] *köhn.* Əziyyətsiz, əzabsız; asan. *Birənc nə mümkündür ola gənc müyəssər; Zakir, dəmi-əfsun elə şahmarə, dağılsın.* Q.Zakir.

**BİRƏOTU** *is. bot.* Dərman hazırlanan bir bitki. *Birəotu çox hündür və qol-budaqlı bitkilərdən biridir. Növbə ilə düzülmüş və kəskin ətirli iyə malik, tünd yaşıl yarpaqları vardır.* Əliyev.

**BİRƏR** *say* Hərəsinə, hər birinə bir dənə, yaxud hər dəfəsində bir dənə. *Habelə*

*əlifbaya dair yazmış olduğum kitabçadan Avropa ölkələrinin dövlət başçılarına, o cümlədən Peterburqa da birər nüsxə göndərmişəm.* M.F.Axundzadə. [Şair:] *Əvvəl asan görünürkən gözümə dərsi-hesab; Birər əqrəb olub ərqam mənə verdi əzab.* A.Səhhət. *Kiçik bacımla hər birimiz birər xoruz və fərə bəyənmişdik.* A.Şaiq.

**birər-birər** *zərf* Bir-bir, tək-tək. *Cücələrim birər-birər; Suyu görüb yaxın gələr.* A.Səhhət. *Bu gün fövqəladə komisyonun iclası olacaqdı .. yoldaşlar birər-birər yığıldılar.* H.Nəzərli. *İçəridən adamlar birər-birər işlərini qurtarıb çıxdılar.* B.Talıblı.

**birər-ikişər** *zərf* Bir-bir, iki-iki. *Əsgərlərdən çoxu .. çuxura girməyi məsləhət bilib, birər-ikişər, koma-koma bu çuxurlarda otururdular.* Ə.Əbülhəsən.

**BİRƏ-ÜÇ** *zərf* Hər bir say müqabilində üç, üç qat artıq.

**BİRƏ-YÜZ** *zərf* Hər bir saya qarşı yüz, yüz dəfə artıq.

**BİRFAMİLİYALI** *sif.* Başqası ilə eyni familiya daşıyan.

**BİRFAZALI** *sif. fiz.* Bir fazası olan. *Birfazalı generator.*

**BİRFİKİRLİ** *sif.* Eyni fikirdə, məsləkdə, düşüncədə olan, həmfikir.

**BİRFİKİRLİLİK** *is.* Eyni fikirdə, məsləkdə olma, həmfikirlilik.

**BİRGƏ** *zərf* Bir yerdə, birlikdə, bərabər. *Birgə çalışmaq. Birgə oxumaq. Birgə işləmək. Yeməyi bu gün birgə yeyəcəyik. – Bu böyük tarixi imtahan günü; Fəhlə, alim durub birgə sırada.* R.Rza. *Bu səslə ucaltmasaq biz birgə səsimizi; Dövrümüz şair kimi yaşatmayacaq bizi.* M.Dilbazi.

**BİRGƏLİK** *is.* İşdə, fikirdə və s.-də bir olma, həmrəy olma; şəriklik; iş birliyi.

**BİRGƏYAŞAYIŞ** *is.* Bir yerdə yaşama, ictimai mühit, ictimai həyat normaları.

**BİRGÖZ** *is. bot.* Meşə kənarlarında və kolluqlarda bitən kol bitki.

**BİRGÖZLÜ** *sif.* 1. Taygöz.

2. Bir gözü olan. *Birgözlü dükan. Birgözlü körpü.*

**BİRGÜNLÜK** *sif.* 1. Bir gün davam edən, bir gündə görülüb qurtaran, bir gün vaxt tələb edən, bir gündə qurtaran. *Birgünlük yol. Birgünlük iş. Birgünlük yazım qalıb.* // *məc.* Tez ötüb gedən, ömrü çox az olan.

2. Bir günə yetişən, çatan, kifayət edən. *Birgünlük yemək. Birgünlük azuqə. Birgünlük ehtiyat.*

**BİRHECALI** *sif. dilç.* Tək hecası olan, təkhecalı. *Birhecalı söz.*

**BİRHECALILIQ** *is. dilç.* Bir hecadan ibarət olma.

**BİRHƏDLİ** *is. riyaz.* Bir həddən ibarət olan cəbri ifadə.

**BİRHƏFTƏLİK** *sif.* Bir həftə davam edən, bir həftədə görülə bilən, bir həftə müddət üçün nəzərdə tutulan. *Birhəftəlik məlumat. Birhəftəlik iş. Birhəftəlik maaş.*

**BİRHOVUR** *zərf dan.* Bir az, bir dəqiqə. *Birhovur qoy oturaq.*

**BİRHOVURDAN** *zərf dan.* Bir azdan, az zaman sonra, bir qədər sonra. *Gedək, birhovurdan gələrik.*

**BİRHOVURLUQ** *is.* Bir anlıq, bir dəqiqəlik, azacıq zaman üçün.

**BİRHÖRGÜCLÜ** *sif. zool.* Bir hörgücü olan. *Birhörgüclü dəvə.*

**BİRHÜCEYRƏLİ** *sif. biol.* Tək hüceyrədən ibarət olan. *Birhüceyrəli orqanizmlər.*

**BİRXƏTLİ** *sif.* Bir xətt çəkilmiş. *Birxətli dəftər.*

**BİRİ** *əvəz.* 1. Müəyyən olmayan şəxs, kim isə, bir adam. *Biri irəli gəlib sual verdi. Biri varmış, biri yoxmuş...* (nağıl başlanğıcı). *– Bir gün sizlərdən biriniz yenə məni görməyə gəlmişdiniz.* C.Məmmədquluzadə. *Sinninə layiq deyilsə də, kişi qızın xatirəsi üçün yaxşı toy eləmişdir, – deyə məclisdəkilərin biri o birinə pıçıldadı.* Çəmənzəminli. *Hər kəsin öz mövqeyi və öz yerinə görə qüsuru vardır. Birininki az, birininki çox...* M.İbrahimov. ◻ **O biri(si)** – 1) bu yox, digəri, başqası. *O birilərinin də qeydinə qalmaq lazımdır. O birilərinə də xəbər ver.* – [Qəhrəman:] *Görəsən, hansı ata öz ürəyi etibarı ilə o birisindən geniş və üstündür.* S.Rəhimov; 2) ertəsi, ikinci, gələn. *O biri gün. O biri dəfə.* **Heç biri(si)** – heç bir şəxs, heç kəs. *Heç biri razı deyil. – Dərdini yazıb deyirsən ki, şəhərimizin hakimlərinin heç biri sənə bir çarə edə bilmədilər.* C.Məmmədquluzadə.

2. Bir neçə və ya bir çox həmcins şeylərdən birisi. *Təklif edilən layihələrdən biri keçdi. Bunu bəyənmirsən, o birisini götür.* – *Bu yer Azərbaycanın qədim mədəniyyət ocaqlarından biridir.* Mir Cəlal.

**BİRİKDİRİLMƏ** "Birikdirilmək"dən *f. is.*

**BİRİKDİRİLMƏK** *məch.* Yavaş-yavaş toplanılmaq.

**BİRİKDİRMƏ** "Birikdirmək"dən *f.is.*

**BİRİKDİRMƏK** *f.* Yavaş-yavaş yığmaq, toplamaq.

**BİRİKMƏ** "Birikmək"dən *f.is.* Yavaş-yavaş yığılma, toplanma.

**BİRİKMƏK** *f.* Yavaş-yavaş yığışmaq, toplanmaq. *Sanki Nərimanın sözləri onun təsəvvüründə birikib qalan dumanları dağıdırdı.* Mir Cəlal.

**BİRİKMİŞ** *f.sif.* Yığılmış, toplanmış; yığılıb qalmış. *Yarpaqlarda birikmiş damlalar ağırlaşıb yerə düşdükcə, "şib-şib" səsi gəlirdi.* Mir Cəlal. *Əvvəlcə o* [Həmid] *neft çənlərinin içini təmizləyir və çənlərdə birikmiş nefti novlara boşaldaraq anbarlara axıdırdı.* Ə.Məmmədxanlı.

**BİRİLLİK** *sif.* 1. Bir il davam edən, yaxud bir il vaxt tələb edən, birillik müddəti nəzərdə tutan. *Birillik iş. Birillik səyahət. Birillik kurs.* – [Cəmil] *birillik təcrübəsindən başa düşmüşdü ki, istehsalatda iş vaxtı kənar fikirlərlə məşğul olmaq yaramaz.* M.Hüseyn. // *bot.* Bir ilin içində toxum verib məhv olan. *Birillik bitkilər.*

2. Bir yaşında olan. *Birillik dana. Birillik uşaq.*

**BİRİNC** *is.* [*fars.*] *məh.* Düyü. *Nə birincin, əgər nə yağın var; Şükr qıl, sağ əlin, ayağın var.* S.Ə.Şirvani.

**BİRİNCİ** "Bir"dən *sıra s.* 1. Sifət, yaxud əvəzlik mənalarında. 1. *Birinci sıra. Birinci nömrə. Birinci cild. Ayın birinci günü.* // İlk dəfə olan, əvvəlinci. [Miss Hannanın] *Lavarcan yaylasındakı birinci göz yaşları nə üçün idi?* M.S.Ordubadi. [Zorin] *..meşədə birinci dəfə onlarla üz-üzə gələn bu dəstənin .. qüvvətli bir bölük olduğunu öyrənə bildi.* M.Hüseyn. *Ömründə birinci kərə idi ki, Badam xalanın adına evə kağız gəlirdi.* Mir Cəlal.

2. Bir neçə şeyi sadaladıqda, yaxud tutuşdurduqda, o birilərindən əvvəl adı çəkilən şeyi göstərmək üçün işlənir. *Gecə işi gündüz işindən daha yorucudur, bundan əlavə birinci daha az məhsuldardır.* (Qəzetlərdən).

3. Başqalarından qabaq, hamıdan əvvəl. *Birinci kim yazıb qurtardı? Birinci mən gəldim. Bu xəbəri kim birinci eşitdi?*

4. İlk, təzə, yeni, təzə zahir olmuş. *Birinci qar. Günəşin birinci şüalarını seyr etdim. Ağacın birinci çiçəklərini dərdim.*

5. Ən mühüm, ən vacib, əsas mənasında. *Bu məsələ birinci planda durur. Birinci vəzifəmiz budur. Orkestrdə birinci skripka.*

6. Ən yaxşı, ən qabaqcıl, ən qabaqda gedən, üstün. *Yarışda birinci yeri tutmaq. Sinifdə birinci tələbə.* – *Üç yüz tələbənin içində Qəhrəman birinci ad almışdı.* S.Rəhimov. *Hər sənəti tutursan tut, öz işində birinci ol!* Mir *Cəlal.* // Əla, ən yaxşı, ən gözəl, yüksək keyfiyyətli. *Birinci mal. Birinci növ çay.*

7. "Birincisi" şəklində – birinci şərt, ilk şərt. [Məmməd:] *Birincisi budur ki, oğlum Rəsul üçün varlı yerdən qız alma.* "Aşıq Qərib".

**BİRİNCİLİK** *is.* Hər hansı bir keyfiyyət, nailiyyət, xidmət və s. cəhətdən üstünlük; birinci yer. *Yarışda birincilik. Üzgüçülükdə birincilik. Birinciliyi qazanmaq.* – [Əmrülla:] *Moskvadan alınan teleqrama görə pyes yarış komissiyasında birincilik qazanmışdır.* C.Cabbarlı. *Şirin sağ-salamatlıq sözlərindən sonra, özünün at çapmaqda necə birincilik aldığını yazırdı.* Mir Cəlal. *Sarı həm işləyir, həm öyrənir, həm də kursda oxuyub, atıcılıqda birincilik alırdı..* S.Rəhimov.

**BİRİSİ** b a x **biri.** *Muzdur platforma kənarındakı alçaq barılardan birisinə söykənib dayandı.* S.M.Qənizadə. *Darğa birisini, daştərəzisi düz olmadığı üçün falaqqaya saldırıb, palçığın içində döydürürdü.* Çəmənzəminli. *Hikmət İsfahani də qəlbən pəhləvi səltənətinin dağılmasını gözləyənlərdən birisi idi.* M.İbrahimov.

**BİRİYA** *sif.* [*fars.* bi... və *ər.* riya] Riyasız, sədaqətli, səmimi, doğru.

**BİRJA** [*alm.*] *tic. iqtis.* Müxtəlif maliyyə və ticarət sazişləri bağlanan idarə. [Aslan bəy:] *Mən pullarımı neft birjasında aksiya*

*almağa buraxmışam.* A.Şaiq. ◻ **Əmək birjası** – fəhlələri işə götürdükdə, onlarla sahibkarlar arasında vasitəçilik edən idarə.

**BİRJAÇI** *is.* Birjada qiymətlərin düşübqalxmasından qazanc əldə edən adam, möhtəkir.

**BİRJAÇILIQ** *is.* Birjaçının işi, peşəsi.

**BİRKƏRƏLİK** b a x **birdəfəlik.** [Gülçöhrə:] *Qoy atam bilsin, birkərəlik məni öldürsün ki, canım qurtarsın.* Ü.Hacıbəyov. [Məsmə ərinə:] *Kişi, bu fikirləri birkərəlik başından çıxar.* S.Hüseyn.

**BİRKÜÇƏLİ** *sif.* Eyni küçədə yaşayan.

**BİRQAT(LI)** *sif.* 1. Bir qatı, bir layı, bir təbəqəsi olan. *Birqat divar. Birqat qapı. Birqat pəncərə. Birqat karton.*

2. Birmərtəbəli, bir mərtəbəsi olan. *Birqat ev.*

3. Bir endə olan. *Birqat parça. Birqat mahud.*

**BİRQİYMƏTLİ** *sif.* 1. Qiymətləri eyni olan. *Birqiymətli mallar.*

2. Eyni dərəcədə bəyənilən, eyni dərəcədə əhəmiyyətli.

**BİRQİYMƏTLİLİK** *is.* Qiymətlərin eyniliyi, eyni qiymətdə olma.

**BİRQOLLU** *sif.* 1. Ancaq bir qolu olan. *Birqollu paltar.*

2. Yalnız bir şöbəsi olan. *Birqollu yol. Birqollu çay.*

3. Dəstəsi, qulpu, əltutanı bir olan. *Birqollu qazan. Birqollu tava.*

**BİRQULPLU** *sif.* Bir qulpu olan; tayqulp.

**BİRLAMPALI** *sif.* Bir lampası olan. *Birlampalı radio cihazı.*

**BİRLƏÇƏKLİ** *sif. bot.* Bir ləçəyə malik olan. *Birləçəkli bitkilər.*

**BİRLƏPƏLİ** *sif. bot.* Ləpəsi tək, birevcikli. *Birləpəli meyvələr. Buğda, arpa birləpəli, paxla isə ikiləpəlidir. Fındıq birləpəli olur. – Sərvkimilər fəsiləsi .. saçaqlı köklərə malik birləpəli bitkilərdir.* Qədirov.

**BİRLƏŞDİRİCİ** *sif.* İki, ya çox şeyi bir-biri ilə birləşdirən, bağlayan, birləşdirmə vəzifəsini görən. *Dəmiryol şəhərləri birləşdirici bir vasitədir. Birləşdirici maddə. Birləşdirici toxuma anat. – Qazıma qıfılları qazıma borularını bir-birinə bağlayıb, qazıma şamı təşkil edir; bu zaman qazıma qıfılları birləşdirici vasitə olur.* Quliyev. // *məc.* Əlaqələndirici, bağlayıcı, uzlaşdırıcı, uyğunlaşdırıcı. *Hadisələri bir-birinə birləşdirici amillər.*

**BİRLƏŞDİRİLMƏ** "Birləşdirilmək"dən *f.is.*

**BİRLƏŞDİRİLMƏK** "Birləşdirmək"dən *məch.*

**BİRLƏŞDİRMƏ** "Birləşdirmək"dən *f.is.*

**BİRLƏŞDİRMƏK** *f.* 1. Yapışdırmaq, bir-birinə calamaq, qovuşdurmaq, bir-birinə bənd etmək. *Elektrik məftillərini birləşdirmək. Sınmış hissələri lehimlə birləşdirmək.*

2. Bir neçə, yaxud bir çox şeyi bir araya toplayıb bir tam halına salmaq. *Müəssisələri birləşdirmək. Sənayenin eyni tipli sahələrini birləşdirmək.*

3. Aralarında vəhdət, birlik yaratmaq. *Dəstənin apardığı çətin iş onları* [kəşfiyyatçıları] *yumruq kimi birləşdirmişdi.* S.Rəhimov.

4. İctimailəşdirmək, ümumiləşdirmək. *Təsərrüfat alətlərini birləşdirmək.*

5. Aralarında əlaqə yaratmaq, rabitə yaratmaq, bağlamaq. *İki şəhəri bir-biri ilə şose ilə birləşdirmək. Məni telefonda şəhərlə birləşdirin. Çayın hər iki sahilini körpü ilə birləşdirmək.* // Qovuşdurmaq, yaxınlaşdırmaq. *Tale onları birləşdirdi.*

6. *məc.* Uyğunlaşdırmaq, uzlaşdırmaq, əlaqələndirmək, bağlamaq. *Nəzəriyyə ilə təcrübəni birləşdirmək. O, cəsarətlə soyuqqanlığı birləşdirə bilir.*

**BİRLƏŞMƏ** 1. "Birləşmək"dən *f.is.*

2. *is.* Təşkilat, ittifaq, cəmiyyət (müxtəlif müəssisə və idarələrin adı).

3. *is. hərb.* Ayrı-ayrı hərbi hissələrdən və digər müstəqil qoşun vahidlərindən ibarət qrup. *Tank birləşməsi. – Silahlı qüvvələrimizin bütün birləşmə, hissə və bölmələrinin komandirləri öz hissələrinin tam ixtiyarlı rəisləridirlər.* (Qəzetlərdən). *Bununla bərabər, bu cəbhəyə külli miqdarda böyük bombardmançı və qırıcı təyyarə birləşmələri də toplanılmışdı.* Ə.Əbülhəsən.

4. *is.* Qrammatikada: bir neçə sözün birləşməsindən əmələ gələn söz qrupu; tərkib. *Sifət birləşməsi. Təyini söz birləşməsi.*

5. *kim.* Molekulu bir neçə elementin atomlarından ibarət maddə. *Kimyəvi birləşmə.*

*Üzvi birləşmə. Vitaminlər qidalı maddələrdə olan üzvi birləşmələrdir. – Süxurların möhkəmliyi onların mineraloji tərkibindən, mineralların aşınması dərəcəsindən, kristallerarası birləşmə qüvvəsindən .. və s.-dən asılıdır.* Quliyev.

**BİRLƏŞMƏK** *f.* 1. Bir araya toplaşaraq, bir-birinə qarışaraq bir küll halına gəlmək. *Nümayişçilər meydanda birləşəcəklər. Hissələr çayın sahilində birləşdi. Qoşunlar hücum etmək üçün birləşdilər.*

2. İttifaq bağlamaq, həmrəy olmaq, bir araya toplaşmaq, öz qüvvələrini birləşdirmək. *Bütün dünya zəhmətkeşləri sülh uğrunda mübarizə üçün birləşmişlər.*

3. Qovuşmaq, bir-birinə qarışmaq, bitişmək. *İki yolun birləşdiyi nöqtə. Körpünün sahil ilə birləşdiyi yer. Yolların birləşdiyi yerdə üç atlıya rast gəldik.*

4. Əlaqələnmək, aralarında rabitə əmələ gəlmək, bağlanmaq. // *məc.* Evlənmək, həyatlarını bir-birinə bağlamaq.

5. Uyğun olmaq, uyuşmaq, uyğunlaşmaq, razılaşmaq, fikrə şərik olmaq. *Mübahisə edənlər bir məsələdə birləşdilər.*

**BİRLƏŞMİŞ** "Birləşmək"dən *f.sif. Birləşmiş qüvvələr. Çayın birləşmiş iki qolu. Bir nöqtədə birləşmiş xətlər. Birləşmiş Millətlər Təşkilatı.*

**BİRLİK** *is.* 1. Bir olma, bütün olma, parçalara ayrılmama; bütövlük, müttəhidlik, bölünməzlik, vəhdət, yekparəlik. *Bizi ruhlandıran bu şanlı birlik; Bu qüdrət, bu qüvvət, məhəbbət olmuş.* M.Rahim. *Polad birliyimizi sarsıtmasın qoy bu qəm.* Ə.Cəmil.

2. İttifaq. *Buna görə də bizim birlik yaratmağımız lazımdır.* M.S.Ordubadi. *Əsgər, yadındadır o illər, böyük Qorki bütün dünyanı birliyə çağıraraq, bu bəlanı dəf etmək istəyirdi.* Mir Cəlal. [Qoca:] *Sənin kəlamına qulaq asıb mən də "qardaşlar" birliyinə qoşulmuşam.* Ə.Məmmədxanlı.

3. *məc.* Ünsiyyət, əlaqə. *Vəhşilər ilə nədir bu birlik? İnsan ilə xoş deyilmi dirlik?* Füzuli.

4. Sıx əlaqə, həmrəylik, ümumilik, uyğunluq. *Fikir birliyi. Mənafe birliyi. İş birliyi.*

5. Ortaqlıq.

6. Ölçüsü, nömrəsi, sayı və s. bir olan. *Birlik taxta.*

7. B a x **birləşmə** 2-ci mənada. *Azərneft birliyi.*

**BİRLİKDƏ** *zərf* Bir yerdə, bərabər, birgə, başqası ilə bir olaraq, şərikli, əlbir surətdə, elliklə. *Birlikdə çalışmaq. İşi birlikdə görmək. Məsələni birlikdə həll etmək. – Mənim yeganə arzum sizin onunla birlikdə qurmaq istədiyiniz xoşbəxtliyi görməkdir.* M.S.Ordubadi. *Azca gəzmək üçün axşamüstü Firidun Qəhrəmani ilə birlikdə küçəyə çıxmışdı.* M.İbrahimov. *Sənəm atası ilə birlikdə çuvalları .. arabaya yığdı.* Ə.Əbülhəsən.

**BİRMALI** *sif.* və *is.* Birma əhalisinə mənsub olan. *Pillələr boyu sütunların altında birmalı qadınlar, qızlar çiçək və şam satırlar.* M.İbrahimov.

**BİRMANATLIQ** 1. *sif.* Bir manata dəyən, bir manat qiymətində olan. *Birmanatlıq bilet.*

2. *is.* Bir manat qiymətində kağız və ya metal pul. *Birmanatlığı xırdalamaq.*

**BİRMƏCHULLU** *sif. riyaz.* Tərkibində bir məchul ədəd olan. *Birməchullu düstur.*

**BİRMƏHƏLLƏLİ** *sif.* Eyni məhəllədə yaşayan.

**BİRMƏNALI** *sif. dilç.* Bir mənası olan. *Birmənalı söz.*

**BİRMƏNALILIQ** *is.* Bir mənada olma xassəsi. *Sözün birmənalılığı.*

**BİRMƏNZİLLİ** *sif.* Bir mənzili olan. *Birmənzilli ev.*

**BİRMƏRTƏBƏ(Lİ)** *sif.* Bir mərtəbəsi, bir qatı olan. *Birmərtəbəli bina. – Həyatin sol tərəfindəki birmərtəbəli evin iki qapısı vardı.* S.Rəhman.

**BİRMƏSLƏKLİ** *sif.* Eyni məsləkə mənsub olan, həmməslək.

**BİRMOTORLU** *sif.* Ancaq bir motoru olan, bir motorla işləyən. *Birmotorlu təyyarə.*

**BİRNƏFƏRLİK** b a x **biradamlıq.**

**BİRNƏFƏSƏ** *zərf* 1. Arası kəsilmədən, aramsız, arada durmadan, dayanmadan. *Birnəfəsə danışmaq. Birnəfəsə qışqırmaq. Birnəfəsə yüyürmək. – Mən bu əsəri .. böyük bir ləzzətlə və birnəfəsə axıra qədər oxudum, gənc qələm yoldaşıma minnətdarlıq hissi ilə jurnalı bükdüm.* M.İbrahimov. // İstirahət etmədən, ara vermədən, tənəffüs etmədən. *Səhərdən axşama qədər birnəfəsə işləyir. Birnəfəsə danışmaq.*

2. Hamısını birdən, tələsik. *Birnəfəsə yemək. Bütün suyu birnəfəsə içdi. – Kişi parçı birnəfəsə başına çəkdi.* İ.Əfəndiyev.

**BİRNÖVBƏLİ** *sif.* Bir növbədə olan, icra edilən. *Birnövbəli iş.*

**BİRNÜVƏLİ** *sif. xüs*. İçində tək nüvəsi olan. *Birnüvəli hüceyrə.*

**BİROXLU** *sif.* Bir oxu olan.

**BİROTURUMA** *zərf* Bir dəfə oturduqda, bir dəfədə. *Biroturuma on qutab yedi. O, biroturuma beş stəkan çay içir.*

**BİRPALATALI** *sif. siyasi.* Yalnız bir palatası olan, bir qanunverici palatadan ibarət olan. *Birpalatalı parlament.*

**BİRPƏRDƏLİ** *sif.* Bir pərdədən (hissədən) ibarət olan. *Birpərdəli pyes. Birpərdəli tamaşa.*

**BİRRƏQƏMLİ** *sif. riyaz.* Rəqəmi tək olan. *Birrəqəmli say.*

**BİRRƏNGLİ** *sif.* Bir rəngə boyanmış; saya. *Birrəngli rəsm. Birrəngli divar kağızı. Birrəngli parça.*

**BİRSAATLIQ** *sif.* Bir saat davam edən, bir saat vaxt tələb edən, bir saat vaxt üçün müəyyən edilmiş. *Birsaatlıq tənəffüs. Birsaatlıq iş. Birsaatlıq gəzinti.*

**BİRSƏSLİ** *sif. mus.* Eyni səsdə olan, bir səslə ifa edilən. *Birsəsli xor. – Birsəsli xalq mahnılarında belə müşayiətedici səslərin olmaması, heç də melodiyanın əhəmiyyətini azaltmır.* Ə.Bədəlbəyli.

**BİRSƏSLİLİK** *is.* Bir səsdə, eyni səsdə olma xassəsi. *Xorun birsəsliliyi.*

**BİRSİMLİ** *sif.* Yalnız bir simi olan. *Birsimli çalğı aləti.*

**BİRTAYLI** *sif.* Bir tayı olan. *Birtaylı qapı.*

**BİRTƏBƏQƏLİ** *sif.* Bir təbəqədən, bir qatdan, bir laydan ibarət olan. *Birtəbəqəli karton. Birtəbəqəli torpaq.*

**BİRTƏBƏQƏLİLİK** *is.* Birtəbəqəli şeyin halı. *Torpağın birtəbəqəliliyi.*

**BİRTƏRƏFLİ** *sif.* 1. Bir tərəfi olan. *Birtərəfli sütun. Birtərəfli cisim.* // Yalnız bir istiqamətdə, bir tərəfdə gedən, cərəyan edən. *Nəqliyyatın küçədə birtərəfli hərəkəti. Birtərəfli teleqraf rabitəsi.* // Yalnız bir tərəfdə olan, baş verən. *Birtərəfli plevrit. Birtərəfli iflic.*

2. İştirakçıların biri tərəfindən, bir şəxs tərəfindən icra edilən. *Müqavilənin birtərəfli ləğvi.*

3. *məc*. Bir şeyin, hadisənin yalnız bir tərəfini qavrayan, yalnız bir tərəfinə yönəldilmiş; çox məhdud. *Birtərəfli mühakimə. Birtərəfli inkişaf. Birtərəfli alimlik. Birtərəfli tərbiyə. – Həyatı birtərəfli* (z.) *göstərən, aktual mövzunu sönük və cansız halda əks etdirən .. əsərlərin səhnədə uzun müddət ömür sürməsi bizi bir daha düşündürməlidir.* M.İbrahimov.

**BİRTƏRƏFLİLİK** *is.* Birtərəfli şeyin halı. *Görüşlərin birtərəfliliyi. Mübahisədə birtərəflilik. Mühakimədə birtərəflilik.*

**BİRTƏRKİBLİ** *sif.* Tərkibi bir şeydən, bir ünsürdən ibarət olan; bəsit. *Birtərkibli dərman. Birtərkibli maddə. Birtərkibli filiz.*

**BİRTƏRKİBLİLİK** *is.* Birtərkibli şeyin halı; bəsitlik.

**BİRTİPLİ** *sif.* Tip etibarı ilə başqalarına oxşar; eyni tipdə olan. *Birtipli hərəkət. Birtipli təsərrüfat. Birtipli adamlar.*

**BİRTİPLİLİK** *is.* Bir tipdə olma xassəsi.

**BİRTOXUMLU** *sif.* 1. Bir cür toxum əkilmiş. *Birtoxumlu tarla.*

2. Tək çəyirdəkli (meyvə). *Şaftalı, gilas birtoxumlu meyvələrdəndir.*

**BİRTONLU** *sif.* Bir tonda olan, yeknəsəq, yekrəng.

**BİRTONLUQ** *sif.* 1. Bir ton ağırlığında şey tutan. *Birtonluq vaqon. Birtonluq maşın.*

2. Bir ton ağırlığında olan. *Birtonluq yük.*

**BİRTUMLU** b a x **birtoxumlu.**

**BİRUH** *sif.* [*fars.* bi... və *ər.* ruh] Ruhsuz, cansız, ölü. *Gül kimi cisimlər, hamı biruh.* M.Ə.Sabir. *Hamı müqəvva kimi biruhü can; Çanta dalında dolaşır dərbədər.* C.Cabbarlı.

**BİRUN** *is.* [*fars.*] *köhn.* Çöl, bayır, dışarı.

**BİRUNİ** *sif.* [*fars.*] *köhn.* 1. Xarici, zahiri.

2. İran evlərinin kişilərə məxsus olan qismi.

**BİRÜZ(LÜ)** *sif. riyaz.* Bir üzü olan. *Birüzlü səth.*

**BİRÜZLÜLÜK** *is*. Birüzlü şeyin halı.

**BİRÜZVLÜ** *sif.* Bir üzvdən ibarət olan.

**BİRYAN** [*fars.*] b a x **büryan.**

**BİRYANLI** *sif.* Birtərəfli, bir yanı olan.

**BİRYAŞAR** *sif.* Bir yaşın içində olan, biryaşlı. *Biryaşar dana. Biryaşar uşaq.*

**BİRYAŞLI** *sif.* 1. Bir yaşına dolmuş. *Biryaşlı qulun. Biryaşlı uşaq.*

2. Yaşları bərabər olan, yaşıd. *Biryaşlı gənclər.*

**BİRYERLİ**[1] *sif.* və *is.* Həmyerli, bir yerdən olan, həmvətən, həmşəhərli, həmkəndli. *O mənimlə biryerlidir. Biz biryerliyik.*

**BİRYERLİ**[2] *sif.* Ancaq bir yeri olan, biradamlıq. *Biryerli loja. Biryerli təyyarə. Biryerli kupe.*

**BİRYOLLU** *sif. dan.* 1. Gediş-gəliş yolu bir olan.

2. B a x **biryolluq.** *Sözünü biryollu söylə, qurtarsın.*

**BİRYOLLUQ** *zərf* Birdəfəlik, həmişəlik, qəti olaraq. *İşi biryolluq qurtarmalı. Məsələni biryolluq həll etməli. Biryolluq cavab ver.* – [Səlimnaz] .. *təkliyin daşını biryolluq atacaqdı.* M.Hüseyn.

**BİS** [*lat.*] İkinci dəfə, bir də təkrar (teatrda, konsertdə və s.-də artistə öz çıxışını təkrar etdirmək üçün tamaşaçıların işlətdiyi nida).

**BİSAHİB** *sif.* [*fars.* bi... və *ər.* sahib] 1. Sahibsiz, yiyəsiz. *Bisahib ev. Bisahib at.*

2. Baxımsız, himayəsiz, kimsəsiz. *Bisahib uşaq.* – [Sona xanım:] *Qurbanın olum, məni öldür, onu aparma! Məni bisahib qoyma!* M.F.Axundzadə. *Bu qaranlıq ev içrə bisahib; Ürəyim tifl, taleyim rahib.* A.Səhhət.

**BİSAVAD** *sif.* [*fars.* bi... və *ər.* səvad] b a x **savadsız.** *Bisavad adam.* – [İkinci kəndli:] *Biz də .. bisavad adamıq, kitabdan nə baş açacaq idik.* Ə.Haqverdiyev. // İs. mənasında. *Bisavadları savadlandırmaq.*

**BİSAVADLIQ** *is.* Savadsızlıq. [Səlim:] *Bunlar hamısı mənim bisavadlığımdandır.* Ə.Haqverdiyev.

**BİSƏBAT** *sif.* [*fars.* bi... və *ər.* səbat] Səbatsız, davamsız; müvəqqəti, ötəri, keçici.

**BİSƏBƏB** *zərf* [*fars.* bi... və *ər.* səbəb] Səbəbsiz. *Qeyrə eylər bisəbəb min iltifat ol nuşləb.* Füzuli. *Aləm bilir bivasitə, bisəbəb; Müşküldür arizə divandan mədəd.* Q.Zakir. *Bisəbəb qan tökmək istərsən, nədir axır səbəb?* S.Ə.Şirvani.

**BİSƏMƏR** *zərf* [*fars.* bi... və *ər.* səmər] Səmərəsiz, faydasız. *Xəyali-ləli-yar ilə həmişə məstəm, ey vaiz; Nədir vermək mənə meydən dəmadəm bisəmər tövbə.* S.Ə.Şirvani. *Biz məgər ondan ötrü xəlq olduq; Ki, qalaq bisəmər bu səhradə?* A.Səhhət.

**BİSƏRÜPA** *sif.* və *zərf* [*fars.*] *köhn.* Avara, sərsəri. *Mən bisərüpa ona nə layiq; Kim, hüsnümə ola kimsə aşiq.* Füzuli. [Hacı Kamyab:] *Hərçi səy eylədim, qardaşım oğlunu avara yoldaşlarından və bisərüpa gəzməyindən çəkindirə bilmədim.* Ə.Haqverdiyev.

**BİSKVİT** *is.* [*fr.*] Un, yumurta, şəkər və s. qatışığından hazırlanmış şirniyyat. *Vanilli biskvit. – Söhbət edə-edə bir parça biskvitlə çaylarını içməyə başlarkən, Hacıyev Qulamın yanına qayıtdı.* Ə.Əbülhəsən.

**BİSMİLLAH** [*ər.*] 1. Əsil mənası "Allahın adı ilə" olub, dindar müsəlmanların bir işə başlarkən dua kimi işlətdikləri söz. [Məsmə] *bismillah deyib ayaq basmaq istəyirdi, yadına düşdü ki, indi Tahirzadə evdə olmaz.* Mir Cəlal. // Yeməyə dəvət. [Məmməd bəy:] – *Uşaqlar, bismillah! – dedi, əlini süfrəyə uzatdı, qonaqlar da yeməyə başladılar.* Çəmənzəminli. *Gözlərini dolmadan çəkməmiş Məşədi Heydər daha tab gətirə bilməyib "bismillah" deyə yeməyə təklif etdi...* B.Talıblı.

2. *məc. dan.* Buyur, başla, elə, et mənasında. [Salman:] *Qardaş, indi ixtiyar sahibisən, əgər məni öldürmək fikrindən daşınmayıbsan isə, bismillah, sözüm yoxdur.* Ə.Haqverdiyev.

3. *dan.* Təəccüb bildirən nida kimi işlənir. *Bismillah, belə də böhtan olar.*

**BİŞ-DÜŞ** *is. dan.* Xörək; xörək bişirmə işi. *Oturub ac komasında atamın; Biş-düşün hazır edərdim anamın.* M.Ə.Sabir.

**BİŞƏK(K)** *zərf* [*fars.* bi... və *ər.* şəkk] Şəksiz, şübhəsiz, yəqin. [Şölə xanım:] *Amma xan bişək və şübhəsiz Teymur ağanı öldürəcək.* M.F.Axundzadə. *Gərçi var iş qanan kişi tək-tək; Əksəri-xəlq avamdır bişək.* S.Ə.Şirvani.

**BİŞƏRƏF** *sif.* [*fars.* bi... və *ər.* şərəf] Şərəfsiz. *Bişərəf adam.* – [Kərim kişi:] *Bir adam tapılmaz ki, desin, Kərim kişi dünyadan bişərəf getdi.* M.İbrahimov. // Söyüş mənasında. [Məhbusi:] *...Bişərəflər məndə salamat yer qoymadılar.* M.İbrahimov. [Gənclərdən biri:] *Otur yerə, bişərəf oğlu, bişərəf!* P.Makulu.

**BİŞƏRƏFLİK** *is.* Şərəfsizlik.

**BİŞİ** *is.* Yağlı şirin xəmirdən bişirilən nazik qoğal növü.

**BİŞİR-DÜŞÜR** *is.* Xörək bişirmə.

**BİŞİRİB-DÜŞÜRMƏK** *f.* b a x **bişirmək** 1-ci mənada. ☐ **Bişirib-düşürən** – xörək

bişirən (bəzən arvad mənasında işlənir). [Hacı Murad:] *Adamın bişirib-düşürəni gərəkdir.* S.S.Axundov.

**BİŞİRİLMƏ** "Bişirilmək"dən *f.is.*

**BİŞİRİLMƏK** "Bişirmək"dən *məch. Xörək bişirilmişdir.*

**BİŞİRİLMİŞ** "Bişirilmək"dən *f.sif. Bişirilmiş xörək.*

**BİŞİRMƏ** "Bişirmək"*dən f.is.*

**BİŞİRMƏK** *f.* 1. Odun üstündə qaynatmaqla, qızdırmaqla yeyiləcək hala gətirmək, hazırlamaq. *Xörək bişirmək. Aş bişirmək. Kabab bişirmək.*

2. *xüs.* Odun, şiddətli hərarətin təsiri ilə sıx bərkidib, saxsılaşdırmaq və bu vasitə ilə hazırlamaq (saxsı şeylər, kərpic və s. haqqında). *Kərpic bişirmək.*

3. Yandırmaq, çox təsir etmək (isti, od haqqında). *Gün başımı bişirir.*

4. *məc. dan.* Hazırlamaq, təcrübə qazandırmaq, püxtələndirmək. *Onu işdə bişirmək lazımdır.*

5. *məc. dan.* İnandırmaqla, yaxud dilə tutmaqla birini yola gətirmək, bir işə razı etmək, qabaqcadan hazırlamaq; tovlamaq, qılığına girmək. [Əşrəf] *təyyarəçi olmaq arzusunun qətiyyətinə inanandan sonra, anasını "bişirmək", yola gətirmək xəyalına düşdü.* Mir Cəlal.

◊ **Başını bişirmək** – b a x **baş.**

**BİŞKİN** *sif.* 1. Yaxşı bişmiş, lazımınca bişmiş. *Bişkin çörək.*

2. *məc*. Təcrübəli, çox təcrübə qazanmış, ustalaşmış, püxtə, bilikli. *Bişkin adam. Bişkin usta.* // *məc*. Yetkin, yetişmiş. *Bişkin xətt.*

**BİŞKİNLİK** *is.* 1. Bişkin şeyin halı.

2. *məc*. Təcrübəlilik, yetişkənlik, hazırlılıq, püxtəlik, yetkinlik; bərkdən-boşdan çıxma.

**BİŞMƏ** "Bişmək"dən *f.is.*

**BİŞMƏK** *f.* 1. Odda qızarmaq və ya suda qaynamaqla çiyliyi rəf olmaq, yeyiləcək hala gəlmək. *Ət bişdi. Lobya bişdi*

2. *xüs.* Odun, şiddətli hərarətin təsiri ilə bərkiyib saxsılaşmaq (saxsı, kərpic və s. haqqında).

3. *məc*. Təcrübələnmək, ustalaşmaq, püxtələnmək, bərkdən-boşdan çıxmaq. *Adam işdə bişər.* – [Dəmirov:] *Ancaq hələlik burada bişərsən, sonra baxarıq.* S.Rəhimov. // Eyni mənada "bişib-bərkimək" şəklində. *Muzdur Məşədi Əsgər iyirmi səkkiz ilin ərzində su ilə od arasında bişib-bərkidiyindən əsla azar-bezar bilməzdi.* S.M.Qənizadə. // Yetişmək, kamilləşmək, kamala çatmaq. [Toxtamış:] *Fikrim bişmiş və kamala çatmışdır.* M.S.Ordubadi.

**BİŞMİŞ** 1. *sif.* Odda qızardılmaqla və ya suda qaynadılmaqla hazırlanmış (*çiy* müqabili). *Bişmiş ət. Bişmiş yumurta. Bişmiş kartof.*

2. *sif. xüs.* Odun, şiddətli hərarətin təsiri ilə bərkiyib saxsılaşmış. *Bişmiş kərpic.*

3. *sif. məc.* Təcrübələnmiş, ustalaşmış, püxtələnmiş, bərkdən-boşdan çıxmış. *Bişmiş adam.* // Yetişmiş, yetkin. *Anlaşılacaq, aydın, gözəl və bişmiş xətti vardır.* M.S.Ordubadi.

4. *is.* Xörək, yemək. *Bişmiş bişirmək. – Bişmişlərimiz min cürə ləzzətli qidadır.* M.Ə.Sabir. [Vəli bəy:] *Rusiyada bir bişmiş tapmazsan ki, ona donuz əti qatmasınlar.* S.S.Axundov. *Qulluqçu taxtapuşda yer saldı, çıxıb uzandım və vaxtı-vaxtında da bişmiş verirdilər.* Çəmənzəminli.

**BİŞÜBHƏ** *sif.* və *zərf* [*fars.* bi... və *ər.* şübhə] Şübhəsiz, yəqin. *Bir aşiq can verə canana əgər; Bişübhə uçuban behiştə gedər.* Q.Zakir.

**BİŞÜUR** *sif.* [*fars.* bi... və *ər.* şüur] Şüursuz, anlaqsız, qanacaqsız, düşüncəsiz. *Bişüur adam.* – [Qaraş:] *Süleyman bəyin də, yoldaşlarının da güdaza getməyi, sən* [Həsənəli] *kimi bişüur yoldaşların bərəkətindəndir.* C.Məmmədquluzadə. [Mayor:] *Elə igid xalqdan bu cür bişüur oğlan .. heç gözləməzdim.* M.Hüseyn. // İs. mənasında. *Bu bişüurların ağlına, kamalına bax bir!* M.Ə.Sabir.

**BİT** *is.* İnsan və heyvan qanını sormaqla qidalanan kiçik, qanadsız cücü.

**BİTAB** *zərf* [*fars.*] Tabsız, taqətsiz, üzgün. *Bitab olmaq. Bitab düşmək. – Şəm istər müttəsil bitab öz pərvanəsin; Qönçeyi-gül əndəlibin naleyi-zarın sevər.* Qövsi. *Gülsüm ağlamaqdan bir payədə bitab olmuşdu ki, yolu gedə bilmirdi.* Ə.Haqverdiyev. *Biçarə* [Məşədi Əsgər] *qolunun ağrısından bitab düşüb, nəhayət, məşəqqətlə özünü sınıqçı Kərbəlayı Piriyə yetirdi.* S.M.Qənizadə.

**BİTABLIQ** *is.* Tabsızlıq, qüvvətsizlik, taqətsizlik.

**BİTAQƏT** *zərf* [*fars.* bi... və *ər.* taqət] Taqətsiz. *Belə gözəl düşə ay qabağına; Tamaşa eyləyən bitaqət olur.* M.P.Vaqif.

**BİTAQƏTLİK** *is.* Taqətsizlik, gücsüzlük, üzgünlük. – *Yanar, tab eyləməz, bir şöleyişəm ilə pərvanə; O bitaqətlik ilə bunca nə lafü gəzaf eylər.* S.Ə.Şirvani.

**BİTƏCRÜBƏ** *sif.* [*fars.* bi... və *ər.* təcrübə] Təcrübəsiz, naşı.

**BİTƏQSİR** *sif.* və *zərf* [*fars.* bi... və *ər.* təqsir] Təqsirsiz, günahsız. *..Biçarə və bitəqsir Yusif Sərracı bədbəxt etdilər.* M.F.Axundzadə. *Bitəqsirəm, yoxdur bir günah bənim; İndi belə qalıb ixtiyar sana.* Aşıq Pəri.

**BİTƏMƏNNA** *sif.* və *zərf* [*fars.* bi... və *ər.* təmənna] Təmənnasız, heç bir gizli məqsəd güdmədən, heç bir umacağı olmadan.

**BİTƏRBİYƏ** *sif.* [*fars.* bi... və *ər.* tərbiyə] Tərbiyəsiz.

**BİTƏRBİYƏLİK** *is.* Tərbiyəsizlik, *Bitərbiyəliklə tifli-məsum; Axırda olur səfilü məşum.* M.Ə.Sabir.

**BİTƏRBİYƏT** *köhn.* bax **bitərbiyə.** *Elmsiz kimsənə hünərsizdir; Elmi-bitərbiyət səmərsizdir.* S.Ə.Şirvani.

**BİTƏRƏDDÜD** *zərf* [*fars.* bi... və *ər.* tərəddüd] Tərəddüdsüz, tərəddüd etmədən, qətiyyətlə.

**BİTƏRƏF** [*fars.* bi... və *ər.* tərəf] 1. *sif.* Heç bir tərəfin mənafeyini saxlamayan, heç birinin tərəfini saxlamayan; mübahisə və ya mübarizə edən tərəflərin heç birinə mənsub olmayan, heç bir tərəfə meyil etməyən. *Bitərəf adam.* – *Mən heç kəsdən qorxmuram, hər kəs məni zərərsiz və bitərəf bir şəxsiyyət kimi tanıyır.* M.S.Ordubadi. [Müəllim] *Əsədi qorxaqlıqda müttəhim edib deyinirdi, Mahmud əmi bitərəf idi.* B.Talıblı. // *hüq.* Başqa dövlətlər arasında gedən mübarizədə iştirak etməyən, bitərəfliyə riayət edən. *Bitərəf dövlətlər.*

2. *sif.* Heç bir partiyaya mənsub olmayan. *Bitərəf nümayəndələr.*

3. *is. dan.* Partiya üzvü olmayan adam.

**BİTƏRƏFANƏ** *zərf* Heç bir tərəfin mənafeyini saxlamayaraq, heç bir tərəfin mübahisə, fikir və mübarizəsinə qarışmayaraq. *Bitərəfanə rəy söyləmək. Bitərəfanə hərəkət etmək. İşə bitərəfanə baxmaq.*

**BİTƏRƏFLƏŞDİRİCİ** *sif.* Bitərəf hala salan.

**BİTƏRƏFLƏŞDİRİLMƏ** "Bitərəfləşdirilmək"dən *f.is.*

**BİTƏRƏFLƏŞDİRİLMƏK** *məch.* Bitərəf hala, bitərəf vəziyyətə salınmaq.

**BİTƏRƏFLƏŞDİRMƏ** "Bitərəfləşdirmək"dən *f.is.*

**BİTƏRƏFLƏŞDİRMƏK** *f.* Bitərəf hala, bitərəf vəziyyətə salmaq.

**BİTƏRƏFLƏŞMƏ** "Bitərəfləşmək"dən *f.is.*

**BİTƏRƏFLƏŞMƏK** *f.* Bitərəf hala keçmək, bitərəf vəziyyət almaq.

**BİTƏRƏFLİK** *is.* Mübahisə, mübarizə, müharibə edən tərəflərin heç birinə mənsub olmama. *Bitərəfliyi gözləmək. Bitərəfliyi pozmaq.* – *Helminin bu dəstə ilə Təbrizi işğal etməsi də İranın Rusiya əleyhinə olaraq bitərəfliyini pozmaq demək idi.* M.S.Ordubadi.

**BİTİB-TÜKƏNMƏZ** *sif.* Son dərəcə çox, bitməyən, qurtarmayan, axırı olmayan. *Həkim baba bağçada tək-təkana işləmir, yeri gələndə nəvə-nəticəsini də bu bağçanın bitib-tükənməz işinə qoşurdu.* S.Rəhimov.

**BİTİK** *is. köhn.* Məktub, kağız. // Dua yazılmış kağız parçası.

**BİTİRİLMƏ** "Bitirilmək"dən *f.is.*

**BİTİRİLMƏK** *məch.* Axıra çatdırılmaq, tamamlanmaq, başa çatdırılmaq.

**BİTİRMƏ¹** "Bitirmək¹"dən *f.is.*

**BİTİRMƏ²** "Bitirmək²"dən *f.is.*

**BİTİRMƏK¹** *f.* 1. Axıra çatdırmaq, başa çatdırmaq, tamamlamaq, qurtarmaq. *Söhbəti bitirmək. Məktəbi bitirmək.* – *Nazlı nağılını bitirib, Ağabəyimin üzünə baxdı. Uşaq totuq əlini yanağına söykəyib, çoxdan yatmışdı.* Çəmənzəminli. *Hədiyyə naharını təzəcə bitirmişdi ki, qapıda maşın səsləndi.* Mir Cəlal.

2. Yerinə yetirmək, görüb qurtarmaq. *Zavod öz illik planını vaxtından əvvəl bitirmişdir. İşimi bitirən kimi kinoya gedəcəyəm.*

**BİTİRMƏK²** *f.* Yetişdirmək, hasil etmək, göyərtmək, cücərtmək. *Bu torpaq buğda bitirmir.* – *Kənari-çeşmimə sancıldı oxların neytək; Sudan qəmiş bitirən Kür kənarına bənzər.* S.Ə.Şirvani.

**BİTİŞDİRİCİ** *sif. xüs.* Bitişdirmə, yapışdırma, qovuşdurma qabiliyyəti olan. *Bitişdirici toxumalar. Bitişdirici maddələr.*

**BİTİŞDİRİLMƏ** "Bitişdirilmək"dən *f.is.*

**BİTİŞDİRİLMƏK** *məch.* Bir-birinə calanmaq, birləşdirilmək, rəbt edilmək, yapışdırılmaq, bağlanmaq.

**BİTİŞDİRMƏ** "Bitişdirmək"dən *f.is.*

**BİTİŞDİRMƏK** *f.* İki şeyi bir-birinə calamaq, birləşdirmək, rəbt etmək, bir-birinə sıx yapışdırmaq. *Bitişdirib mıxlamaq. Qaynaq edib bitişdirmək. Hərfləri bitişdirmək.*

**BİTİŞİK** *sif.* 1. Bir-birinə bitişmiş halda olan. *Bitişik karton. Bitişik barmaqlar.*

2. Bir-birinə yapışıq, qonşu. *Bitişik ev. Bitişik divar. – Pəri Soltanın evi zindana bitişik idi.* (Nağıl).

3. Bitişmə yeri, şeylərin bir-birinə bitişdiyi yer.

**BİTİŞİKLİK** *is.* Bitişik şeyin halı.

**BİTİŞMƏ** "Bitişmək"dən *f.is.*

**BİTİŞMƏK** *f.* Bir-birinə qovuşub birləşmək, yapışmaq, calanmaq. *Almanın calağı bitişibdir. Yaranın ağzı bitişdi. Sınan şüşə çətin bitişər. – Borular bir-birinə bitişdi və sonra xırıldayaraq yavaş-yavaş quyuya getməyə başladı.* M.Hüseyn.

**BİTİŞMİŞ** *f.sif.* Bir-birinə qovuşub birləşmiş, yapışmış, calanmış.

**BİTKİ** *is.* Göyərti, nəbatat; ağac, ot, çiçək və s. kimi torpaqda bitən hər şey. *Yabanı bitkilər. Kənd təsərrüfat bitkiləri. Texniki bitkilər* (sənayedə istifadə olunan bitkilər). *Çoxillik bitki* (bir neçə il yaşayan bitki). *Bitki aləmi* (bir yerin, ölkənin bütün bitkiləri).

**BİTKİÇİ** *is.* Bitki və əkin işləri ilə məşğul olan adam; bitki becərən və yetişdirən adam; bitkiçilik mütəxəssisi. *Bitkiçilərin qarşısında duran mühüm vəzifələrdən biri heyvandarlıq üçün möhkəm yem bazası yaratmaqdır.*

**BİTKİÇİLİK** *is.* 1. Bitki yetişdirmə sənəti, işi. Bitkiçiliklə məşğul olma.

2. Kənd təsərrüfat bitkiləri yetişdirmə üsullarından bəhs edən elm. *Bitkiçilik kafedrası.*

**BİTKİN** *sif.* Bitmiş, qurtarmış; tamamlanmış halda olan. *Bitkin cümlə. Bitkin söz.* // Yetişmiş, kamil, mükəmməl. *Girəydim siz girən yeni bağçaya; Gözümlə görəydim bitkin barını.* A.Şaiq.

**BİTKİNLİK** *is.* Bitkin şeyin halı; kamillik, mükəmməllik.

**BİTLƏMƏ** "Bitləmək"dən *f.is.*

**BİTLƏMƏK** *f.* Bitləri təmizləmək.

**BİTLƏNMƏ** "Bitlənmək"dən *f.is.*

**BİTLƏNMƏK** 1. *f.* Bitli hala düşmək; paltarını, başını bit basmaq.

2. *qayıd.* Özünün, öz paltarının bitlərini təmizləmək.

**BİTLİ** *sif.* Biti olan; başını, paltarını bit basmış. // Natəmiz, pinti.

**BİTLİLİK** *is.* Bitli şeyin, adamın halı. // Natəmizlik, pintilik.

**BİTMƏ¹** "Bitmək¹"dən *f.is.*

**BİTMƏ²** "Bitmək²"dən *f.is.*

**BİTMƏK¹** *f.* 1. Tamam olmaq, qurtarmaq, axıra çatmaq, başa çatmaq. *Məzuniyyət müddəti bitdi. – Qəmimiz bitdi, fərəh oldu nümudar bu gün!* M.Ə.Sabir. *Kərbəlayı Məhəmməd ustanın hekayəsi bitən kimi, dərin bir etiqad ilə üzünü göyə çöndərdi.* Çəmənzəminli. // İşi axıra çatmaq, qurtarmaq. *İclas bitdi. Hər kəs öz aşna-dostu ilə danışa-danışa evlərinə getdi.* B.Talıblı. // Tükənmək. *Kainatın bəzəkli şux gəlini; Bitdi artıq mənim qərarım, gəl.* S.Rüstəm.

2. Nəticələnmək. *Mübahisə nə ilə bitdi? – Pulun getdiyinə baxma, işin bitdiyinə bax.* (Ata. sözü). *Qalib dönəcəksən bilirəm bunu; Get, ölümlə bitsin yağının sonu.* S.Rüstəm.

3. Saralmaq, saralıb qurtarmaq; bitişmək (yara). *Ey söyləyən Füzuliyə eşq içrə səbr qıl; Söylə, bu məlhəm ilə kimin bitdi yarəsi?* Füzuli.

4. Yerinə yetirmək, əməl etmək. [Hacı Qənbər:] *Dürüst fikrində saxla mən deyəni bitməsən, başını kəsəcəyəm.* N.Vəzirov.

**BİTMƏK²** *f.* Yetişmək, çıxmaq, cücərmək. *Bu yerlərdə çoxlu fındıq bitir.*

**BİTMƏYƏN** *f.sif.* Bitmək, qurtarmaq bilməyən; intəhasız. *Gah sınıq könlümü etdi şadman; Gah saldı bitməyən savaşa məni.* (Qoşma).

**BİTMƏZ** *sif.* 1. Qurtarmayan, bitməyən, tükənməyən, sonu-axırı olmayan, nəhayətsiz. *Bitməz sərvət. – Yer iftixar edir bitməz varilə.* M.Rahim.

2. *məc.* Başagəlməz, həyata keçirilməsi, yerinə yetirilməsi mümkün olmayan. – [Cəbi:] *Cəbini buyurursunuz bitməz işə, adını qoyursunuz yarıtmaz.* N.Vəzirov.

**BİTMƏZLİK** *is.* Bitməyən, qurtarmayan şeyin halı; tükənməzlik.

**BİTMƏZ-TÜKƏNMƏZ** *sif.* Qurtarmayacaq qədər çox; sonsuz, hədsiz, saysız-hesabsız. *Ölkəmizin bitməz-tükənməz təbii sərvətləri vardır. Bitməz-tükənməz mənbə. – Bu sonsuz və bitməz-tükənməz hərarət və ataş mənbəyi insanları cana gətirir.* M.İbrahimov.

**BİTMİŞ** *f.sif.* Qurtarmış, tamam olmuş, tamamlanmış, başa çatmış. *Bitmiş işdən gül iysi gələr.* (Ata. sözü). *İlyasov, Kazım kişinin mətləbini bitmiş hesab etdi.* Mir Cəlal.

**BİTTƏMAM** *zərf* [*fars.* bi... və *ər.* təmam] *köhn.* Tamamilə, bütün, bütünlüklə, hamısı. *Cari olub xublar gəlsə bittəmam; Olmaz belə gözəl, belə xoşəndam.*M.P.Vaqif. *İndi olar da ayılıb bittəmam; Qalmadı heç yerdə sənə ehtiram.* M.Ə.Sabir.

**BİTUM** [*lat.*] *miner. tex.* Karbohidrogenlərdən ibarət təbii və süni qatran maddələrinin ümumi adı: asfalt, neft, qudron və s.

**BİTUMLAŞMA** "Bitumlaşmaq"dan *f.is.*

**BİTUMLAŞMAQ** *f. geol.* Bitum halına gəlmək, bitum şəklinə düşmək; qatranlaşmaq.

**BİTUMLU** *sif.* Tərkibində bitum olan.

**BİVAXT** [*fars.* bi... və *ər.* vəqt] b a x **vaxtsız.** *Mərdan şəhərə gecə bivaxt döndü.* Mir Cəlal.

◊ **Bivaxt xoruz kimi banlamaq** – yersiz, münasibətsiz danışmaq, gözlənmədən yerindən danışmaq.

**BİVARİS** *sif.* və *is.* [*fars.* bi... və *ər.* varis] *köhn*. Varisi, vərəsəsi olmayan; varissiz, vərəsəsiz.

**BİVEC** [*fars.* bi... və *ər.* vəch] b a x **vecsiz.** *Bivec adam. Bivec iş.* – [Hacı Kamyab:] *Mənim bir bivec qardaşım və qardaşımın da bir avara oğlu var.* Ə.Haqverdiyev. [Bağır xan:] *Mən deyən altı min tüfəng .. kara gələn deyildir, köhnə sistemli və bivec şeylərdir*. P.Makulu.

**BİVECLİK** b a x **vecsizlik.**

**BİVƏ** *sif.* [*fars.*] *köhn.* 1. Dul qadın, ərindən boşanmış və ya əri ölmüş arvad. [Tazə:] *Bivə övrətlərin əmri alınırmı nəzərə?* [Köhnə:] *Canı çıxsın, o da getsin yenə bir tazə ərə.* M.Ə.Sabir.

2. Dul kişi, arvadı ölmüş və ya arvadını boşamış kişi.

**BİVƏFA** *sif.* [*fars.* bi... və *ər.* vəfa] b a x **vəfasız.** *Bivəfa yoldaş. Bivəfa dost. – Bivəfa dünyada, dəhri-fənada; Fələk məni yetirmədi murada.* M.V.Vidadi. *Sən oldun aqibət rüxi-dildar məhrəmi; Bir yadə salmadın məni, ey bivəfa könül.* S.Ə.Şirvani. // İs. mənasında. *Ey bivəfa ki, adət olubdur cəfa sana; Billah, cəfadır, olma demək bivəfa sana.* Füzuli. *Nə gərək sevəydim o bivəfanı; Nə də belə hicran dağı görəydim.* Q.Zakir.

**BİVƏFALIQ** b a x **vəfasızlıq**. *Vaxtında sən aşinalıq etdin; Döndün, belə bivəfalıq etdin.* X.Natəvan. *Əzəldən eylədin mənnən aşinalıq; İndi nədən oldu bu bivəfalıq?* Aşıq Dilqəm.

**BİVƏHM** *sif.* [*fars.* bi... və *ər.* vəhm] *köhn.* Qorxusuz, qorxmayan. [Vəzir:] *..Teymur ağa gör necə səndən bivəhmdir ki, günün günortasında mənim kimi kişinin evinə giribdir.* M.F.Axundzadə.

**BİYABAN** *is.* [*fars.*] Otsuz, bitkisiz düz yer; səhra, çöl (bəzən, çöl-biyaban şəklində işlənir). *Ol pir qalıb orada heyran; Məcnun tutuban rəhi-biyaban.* Füzuli. *Gülgəz dəli olub, yoxsa divana; Üz çevirib gedir çöl-biyabana.* Aşıq Abbas. *Gəlmisən dağlar üstə cövlanə; Düşmüsən Qeys tək biyabanə.* S.Ə.Şirvani. *Məcnunun bəxtiyar və gənc yaşında; Axır qərargahı oldu biyaban.* S.Vurğun.

**BİYABANGƏRD** *sif.* [*fars.*] *köhn.* Biyabanları dolaşan avara. *Mərdlə gəzən mərd olar, namərdlə gəzən biyabangərd olar.* (Ata. sözü).

**BİYAN** *is. bot*. Kökündən boya və xalq təbabətində dərman hazırlanan şirinköklü bir bitki. *Pis siloslanan bitkilər bunlardır: gicitkən, yonca, biyan, dəvətikanı və xiyarın yaşıl hissəsi. Qara təpədən biyan talaları da görünürdü.* Ə.Vəliyev.

**BİYANLIQ** *is.* Biyan bitən yer, biyan tarlası.

**BİYAR** *is.* 1. Aprel işğalından əvvəl kəndlilərin mülkədarlar üçün məcburi və müftə olaraq icra etməli olduqları mükəlləfiyyət, iş. [İmamverdi:] *..Bir ay bəylik, bir ay biyar, üç ay qış, üç ay yaz, vur-tut bir ay işləyirsən.* C.Cabbarlı. // Sif. mənasında. *Kənddən bir dənə biyar araba gətirib, qabanın cəmdəyini içinə yıxıb, özüm də üstündə yola düşdüm.* Ə.Haqverdiyev.

2. *məc*. Ümumiyyətlə, zor və cəbr ilə, yaxud könülsüz görülən iş haqqında. *Biyara get, bekar qalma.* (Məsəl).

**BİYARLIQ** *sif.* Biyar yolu ilə görülməli olan, biyara mənsub və aid olan.

**BİZ**[1] *birinci şəxsin cəmi.* 1. Danışan şəxs bu sözlə özü ilə bərabər bir neçə nəfər, yaxud bir çox adam olduğunu bildirir. *Biz qalib gələcəyik. Biz gəlmişdik, sən yox idin. O da bizlə gəldi. – Biz ümid olduq daza, daz özün qoydu naza.* (Ata. sözü).

2. Bəzən "mən" əvəzində deyilir. *Bizim düşüncəmizə görə. Bizim irəli sürdüyümüz fikir. Bizə görə belədir. Bizim tədqiqatımızdan bu nəticə çıxır ki.*

3. Bəzən "lər" cəm şəkilçisi ilə .. **bizlər** – 1) mən və mənim kimilər (*bu mənada bir qədər kinayə çalarlığı var*). *Bizləri daha saymırsan! Bizləri dindirən yoxdur;* 2) danışan şəxsin mənsub olduğu mühiti, cəmiyyəti, xalqı, yeri və s.-ni bildirir. *Bizlərdə adət belədir. – Bəli, bizlərdə övrət boşamaq lazım olanda həmişə meydana bir bəhanə gəlir və halonki kişi övrəti boşamaqda muxtardır...* C.Məmmədquluzadə.

**BİZ**[2] *is.* Deşik açmaq üçün ucu şiş metal alət. *Çəkməçi bizi. –* [Kəlbalı] *yəhərqaş xurcununda həmişə neştər, biz və burulmuş nazik köşə gəzdirər, yeri gələndə işə salırdı.* S.Rəhimov. // Ucu çox sivri, batan şey haqqında. *Biz kimi.*

**BİZAR** b a x **bezar.**

**BİZARAFAT** *zərf* [*fars.* bi... və *ər.* zərafət] Zarafatsız, ciddi. *Bizarafat deyirəm ki, hər kəs rastıma gəlir, – hamısını yavaş-yavaş dinə soyumuş görürəm.* C.Məmmədquluzadə.

**BİZ-BİZ** *zərf* Qabarıq halda, dik vəziyyətdə (tük, dəri haqqında). *Saçları biz-biz durmaq. Bədənim biz-biz olub.*

◊ **Tükləri biz-biz durmaq (olmaq)** – 1) son dərəcə qorxmaq, dəhşətlənmək; qorxudan, həyəcandan, dəhşətdən tükləri ürpərmək. *Elə bir hala düşərsən ki, tükün biz-biz olar.* M.Ə.Sabir. *Aşpazı apardılar. Mənim tüklərim biz-biz durdu.* M.S.Ordubadi. *Bu sübh tezdən* [katib] *şkafın ağzını açarkən gözü icra edilməmiş işlərin tarixinə sataşmış və tükləri biz-biz olmuşdu.* S.Rəhimov; 2) soyuqdan tükləri qabarmaq.

**BİZCİYƏZ** *əvəz.* "Biz[1]"dən *oxş.*

**BİZDİMDİK** *is. zool.* Bizəoxşar əyri və uzun dimdiyi olan cüllüt.

**BİZƏBAN** *sif.* [*fars.*] *klas.* Dilsiz, lal; dilsiz-ağızsız.

**BİZƏVAL** *sif.* [*fars.* bi... və *ər.* zəval] Zavalsız, məhvolmaz, davamlı, yox olmayan, daimi.

**BİZİMKİ** *əvəz.* 1. Bizə məxsus olan, bizə aid olan. *O şeylər bizimkidir.*

2. İs. mənasında, adətən cəm şəklində: **bizimkilər** – bizə yaxın olan adamlar, bizim yoldaşlarımız, bizimlə işləyən, bizimlə həmməslək, ya həmvətən olan adamlar, bizim sıralarımıza daxil olanlar, yaxud bizim ailə (üzvləri). *Bizimkilər çoxdan bağa köçüblər. – Bizimkilər kəmənd atıb metralyozları evlərə çəkdilər.* M.S.Ordubadi. [Surxay:] *..Bizimkilər yığıncaq elədilər.* S.Rəhman.

**BİZQURD** b a x **bizquyruq.**

**BİZQUYRUQ** *is. zool.* İnsanın bağırsağında parazitlik edən, quyruğu biz kimi sivri qurd. *İnsanın bəzi qurdları, məsələn, bizquyruqlar, askaridlər çox vaxt bağırsaqlardan özbaşına və ya ifrazat ilə çıxır.* Ələkbərov.

**BİZLƏMƏ** "Bizləmək"dən *f.is.* *...Eşşəklər uşaqların bağırtısından və bizləməsindən hürküb yerlərindən qopdular.* P.Makulu.

**BİZLƏMƏK** *f.* 1. Biz ilə deşmək, biz soxmaq, biz ilə deşik-deşik etmək, yaxud biz batırmaq.

2. *məc*. Təhrik etmək, məcbur etmək, tovlamaq. [İsgəndər:] *Bacılar hərə bir yandan səni bizləyəcəklər ki, "dinmə, kəs səsini, xortdan gələr, səni aparar".* C.Məmmədquluzadə.

3. Bədəninə iti bir şey batıraraq tələsdirmək, yeyin getməyə məcbur etmək. *İlyas uzunqulağı bizləyib, üzüaşağı çaya tərəf sallandı.* S.Rəhimov. *Qulam dayı özünü toplayıb cəsarətləndi, eşşəyi daha da möhkəm bizlədi.* M.Hüseyn.

**BİZLƏNMƏ** "Bizlənmək"dən *f.is.*

**BİZLƏNMƏK** *məch.* 1. Biz soxulmaq, biz ilə deşilmək.

2. *məc*. Təhrik edilmək, məcbur edilmək.

3. Bədəninə iti bir şey batırılaraq tələsdirilmək, yeyin getməyə məcbur edilmək.

**BİZÓN** *is.* [*lat.*] *zool.* Şimali Amerika vəhşi öküzü.

**BİZOTU** *is. bot.* Quru yamaclarda bitən birillik bitki.

**BİZVARİ** *sif.* Bizə, iynəyə oxşayan, bizşəkilli. *Bizvari yarpaq.*

**BLANK** *is.* [*fr.*] Müəyyən formada sənəd tərtib etmək üçün bir hissəsi çap edilmiş və doldurulmağa görə boş yerlər qoyulmuş vərəqə. *Sübhanverdizadə poçt idarəsindən aldığı blankın ayaq tərəfini göstərərək: – Yoldaş prokuror, – dedi, – həmişə faktdan danışırsan...* S.Rəhimov.

**BLANKÍST** [*xüs. is.*-dən] Blankizm tərəfdarı.

**BLANKÍZM** [XIX əsr fransız inqilabçısı O.Blankinin adından] Kapitalizmi, xalq kütlələrinin sinfi mübarizəsi olmadan, inqilabi sui-qəsd yolu ilə devirmək haqqında xırda burjua nəzəriyyə və taktikası.

**BLEF** *is.* [*ing.*] 1. Olmayan şeylə lovğalanma.

2. Gözə kül üfürmə.

**BLİN** *is.* [*rus.*] Mayalı xəmirdən qızartma üsulu ilə bişirilmiş nazik kökə.

**BLİNDÁJ** [*fr.*] *hərb.* Top və mina atəşindən qorunmaq üçün üstüörtülü möhkəm səngər, mühafizə sipəri. *Burada Zorin üç-dörd yerdə kənd daxmalarına bənzər blindajlar tikdirmişdi.* M.Hüseyn. *Qaraltılar blindaja .. tullanınca birinci olaraq Solovyov Valentina Xolmoqortsevanın səsini eşitdi.* Ə.Əbülhəsən.

**BLOK**[1] [*fr.*] Birgə hərəkət etmək üçün dövlətlər, partiyalar, təşkilatlar, müxtəlif ictimai qruplar arasında düzəldilən ittifaq, birləşmə.

**BLOK**[2] [*ing.*] *tex.* 1. Ağır şeyləri qaldırmaq üçün sadə maşın, mexanizm və onun fırlanan diskdən (çarxdan) ibarət olan hissəsi. *Vışkanın təpəsindən, bucurqada sarınan kanatı .. keçirmək üçün bir blok asılır.* Quliyev.

2. Özü bir sıra element və hissələrdən ibarət olan qurğunun və s.-nin ayrı-ayrı hissəsi. *Pəncərə və qapı blokları. Boruları bloklar halında quraşdırmaq.*

3. Betondan hazırlanan iri kərpiclər şəklində süni tikinti daşı. *Beton bloklar.*

4. Böyük binada mənzillər qrupu. *Mənzilim sol blokdadır.*

**BLOKÁDA** [*ing.*] 1. Mühasirə; mühasirəyə alma.

2. *məc.* Bir dövlətə siyasi təzyiq göstərmək məqsədi ilə onu siyasi və iqtisadi cəhətdən təcrid etmək üçün görülən tədbirlər sistemi. *Siyasi blokada. İqtisadi blokada. Maliyyə blokadası.*

**BLOKNÓT** [*fr.*] Qopardılan ağ kağız vərəqələrindən ibarət dəftər. *Qurbanəli bloknotuna yazır və .. səhnədən çıxır.* M.İbrahimov.

**BLÚZA** [*fr.*] Kəmərsiz geniş köynək şəklində kişi iş paltarı.

**BLÚMİNQ** [*ing.*] *tex.* Çox güclü metalyayma maşını.

**BÓBRİK** [*rus.*] Xovlu mahud parça növü. // Bu parçadan tikilmiş. *Bobrik palto. – Bu zaman Kərbalı tükü tökülmüş bobrik pencəyinin ətəyini dartışdırıb düzəldər...* S.Rəhimov.

**BOÇKÁ** [*rus.* бочка] Çəllək. *Çaxır boçkası. Su boçkası. – Rizvan araba gedə-gedə Xosrovun köməyi ilə çıxıb, ağzı örtülü yağ boçkalarının üstündə oturdu.* S.Rəhimov.

◊ **Boçka kimi** *dan.* – yekəqarın, qarnı yekə.

**BOÇKAÇI** *is.* Boçka (çəllək) qayıran usta; çəlləkçi.

**BOÇKAÇILIQ** *is.* Boçkaçı sənəti; çəlləkçilik.

**BOĞANAQ** 1. *is.* Boğucu hava, havası boğuq olan yer. *Bu otaq yaman boğanaqdır. Bu boğanaqda necə oturubsunuz?* // *sif.* Çox isti və boğucu, bürkü. *Boğanaq hava. Boğanaq otaq. – İyul ayına məxsus boğanaq bir gün idi.* A.Şaiq. *Hava olduqca boğanaq və hünülər qədərindən ziyadə idi.*H.Nəzərli. *Ventilyasiya xarab olduğu üçün, zirzəmi çox boğanaqdı.* Ə.Əbülhəsən.

2. Tozlu hava, toz, tufan. [Güllələrin] *zərbəsindən biçarə ayı, boğanaqdan yıxılan ağac kimi yerə sərildi.* S.S.Axundov. *Kənd yolundan qalxan boğanaqlar .. burula-burula Araz çayına doğru yüyürüşürdü.* M.Hüseyn.

**BOĞAZ**[1] *is.* 1. *anat.* Boyunun, qida borusunun başı və nəfəs yollarının yerləşdiyi ön hissəsi. *Boğazdan yapışmaq. – Gülnaz dartınıb onun əlindən çıxdı, Qəmərbanunun boğazından yapışıb divara çırpdı.* M.İbrahimov. // Ağız içinin dal tərəfindəki boşluq, hülqum. *Boğaz ağrısı.* // Boyun. *Saldı boğazına siçanlar cənab; Vəhşət edib etdi pişik iztirab...* S.Ə.Şirvani.

2. Müxtəlif qabların (şüşələrin və s.-nin) ağızları ilə gövdələri arasındakı dar hissə. *Şüşənin boğazı. – Durna bulağının dar şırranına söykənmiş balaca qırmızı sənəyin boğazından çıxan ağappaq su pıqqıldayır.* S.Rəhimov.

3. Dəyirmanın üst daşındakı deşik. *Dəyirmanın boğazına ölü salsan, diri çıxar* (çox diribaş, zirək adam haqqında).

4. Çəkmə və corabın ayaqlıqdan yuxarı hissəsi. *Yolçu .. sonra çəkmələrinin boğazını bir az yuxarı qaldırıb, sürətli addımlarla şəhərə tərəf yollandı.* S.Rəhman.

5. Dərələrin, çayların baş tərəfi; çay ağzı. *Sürü dərənin boğazında gecələmişdi.*

6. İki dağ arasındakı dar keçid.

7. *coğr.* Dənizin iki quru arasındakı dar hissəsi. *Dardanel boğazı.*

8. *mus.* Müəyyən xanəndənin ifaçılıq sənətində işlətdiyi və yalnız ona xas olan xırda zəngulələr, habelə xırda musiqi ibarələri.

◊ **Boğaz açmaq** – yeməkdən doymamaq, qabağına gələni yemək, acgözlüklə yemək. **Boğaz basmaq** – xalq təbabətində boğaz gələndə (anginada) onun içərisindəki şişi barmaqla sıxıb əzişdirməkdən ibarət müalicə üsulu. **Boğaz olmaq** *məh.* – Borclu olmaq. **Boğaz ortağı olmaq** – başqasının yeməyinə şərik olmaq. **Boğaz otarmaq** – müftəxorluq etmək, orada-burada özünü doydurmaq. **Boğaz uzatmaq** – lovğalanmaq, təşəxxüslənmək. *Bir göl içrə üzürdü bir yekə qaz; Özünə fəxr edib uzatdı boğaz.* S.Ə.Şirvani. **Boğaz yırtmaq** – qışqırmaq, bağırmaq, bərkdən danışmaq. [Zaman:] *Qardaşlar, burada oturub boğaz yırtmaqdan fayda yoxdur!* Ə.Haqverdiyev. **Boğaz(a) döymək** – mübahisə etmək, boş danışmaq, qızğın və kəskin mübahisə etmək, çənə vurmaq. **Boğaza dürtmək** – b a x **boğaz(a) döymək. Boğaza keçmək** – başa bəla olmaq, ilişmək, yapışmaq (arzu edilməyən adam, şey haqqında). *Bir yandan da kor keçi bir bəla kimi* [Həmidin] *boğazına keçmişdi.* Ə.Məmmədxanlı. **Boğaz-boğaza** – baş-başa. [Cənnətəli ağa:] *Səni o qara köpək ilə boğaz-boğaza bağladacağam, hələ bir gözlə.* N.Vəzirov. **Boğazdan yuxarı** – qeyri-səmimi. *Danışır bəziləri, leyk boğazdan yuxarı.* M.Ə.Sabir. **Boğazı biçilmək** – boğazından şey getməmək. *Bu xəbərdən sonra xəstənin vəziyyəti xarablaşdı, boğazı biçildi, iştahası kəsildi.* Mir Cəlal. **Boğazı gəlmək** – əsnəyi iltihab etmək. **Boğazı qovuşmaq** – boğazının yolu tutulmaq, nəfəs ala bilməmək. *Boğazı qovuşub, su da içə bilmir.* **Boğazı qurumaq** – mat qalmaq, qorxmaq, cavab verə bilməmək (qorxudan və s.-dən). *Ağa Mərdanın lap boğazı quruyur.* M.F.Axundzadə. *Səməd xanın boğazı qurudu, güclə cavab verdi.* M.S.Ordubadi. **Boğazı tovlanmaq** – iltihab və s. nəticəsində boğazı təxərrüşlənmək, içi qızarmaq. **Boğazı tutulmaq** – boğulan kimi olmaq, danışa bilməmək, səsi çıxmamaq (qeyzdən, hirsdən, ağlamaqdan və s.-dən). *Sübhanverdizadə od tutub yanır, qışqırmaq, haray salmaq istəyir, ancaq boğazı tutulur, ağzı kilidlənir.* S.Rəhimov. **Boğazına bağlamaq** *məc.* – zorla və ya hiylə ilə qəbul etdirmək, boynuna sarımaq. [Musa:] [Məcnun bəy] *elə bir sənin kimisini axtarırdı ki, qızını onun boğazına bağlasın.* Ə.Haqverdiyev. **Boğazına saxlamaq** – bir qarın çörəyə saxlamaq. *Varlılar Alı kişinin uşaqlarını boğazına saxlayırdılar.* "Qaçaq Nəbi". **Boğazında qalmaq** *məc.* – arzusuna nail olmamaq, ürəyində qalmaq (sözü). **Boğazından çıxmaq** *məc.* – əlindən çıxmaq, qismətindən çıxmaq, nəsib olmamaq. **Boğazından getməmək (keçməmək)** – qorxudan, iztirabdan, yaxud başqa hisslərdən heç bir şey yeyə bilməmək, şiddətli ruhi iztirab keçirmək. *Ağca xanım Qaraca qız barəsində artıq dərəcədə iztirabda idi. Boğazından əsla çörək getmirdi.* S.S.Axundov. **Boğazından kəsmək** – qənaət etmək, özünə qıymamaq. [Qafar:] *Nə qazanıram ki, uşaqlarımın boğazından kəsib ona kirayə verim.* S.S.Axundov. *Azacıq məvacibə qənaət edən muzdur öz boğazından qəpik-qəpik kəsib, on ilin ərzində altı yüz manat pul cəm etmişdi.* S.M.Qənizadə. **Boğazından yapışmaq** *məc.* – qısnamaq, çıxılmaz vəziyyətə salmaq, məcbur etmək. **Boğazını arıtlamaq** – öskürməklə boğazını təmizləmək, danışmağa hazırlaşmaq. *Hüseyn əmi .. əlindəki dəmir milçə ilə çubuğun başını qurdalayır və boğazını arıtlayırdı.* M.S.Ordubadi. *Qavalvuran oğlan ..*

*boğazını arıtlayıb, oxumağa hazırlaşırdı.* M.Hüseyn. **Boğazını islatmaq** *zar.* – bir az içki içmək. **Boğazını qəhər tutmaq** – acığından, hirsindən boğularaq ağlamaq istəmək, lakin ağlaya bilməmək. *Kişi daha da təsirləndi, boğazını qəhər tutdu.* Mir Cəlal. **Boğazının yolu qurumaq** – b a x **boğazı qurumaq.** *Qəribin anasının boğazının yolu qurudu.* "Aşıq Qərib".

**BOĞAZ²** *sif.* Boynunda balası olan. *Boğaz at. Boğaz inək. Boğaz qoyun. – Əmniyyələr boğaz inəyi, eşşəyi və qoyunları tövlədən çıxardılar.* M.İbrahimov. ◻ **Boğaz olmaq** – boynunda balası olmaq, hamilə olmaq.

**BOĞAZADÖYMƏ** *is. dan.* Höcətləşmə, bir-biri ilə sözləşmə, söz güləşdirmə, mübahisə etmə; mübahisə, deyişmə. *İki saatdan bəri davam edən boğazadöymə ağıllı-başlı bir nəticə verməmişdi.* Ə.Əbülhəsən. *Axırda bu boğazadöymədən bir şey çıxmadı.* Ə.Vəliyev.

**BOĞAZALTI** *is.* 1. Balaca şal.

2. Baş örtüyünün boğazın altından bağlanan bağı.

3. Qadınların boğazlarına taxdıqları qızıl zinət. *Bəzən belə söhbət olardı: – Yaxşı, indi ki belə oldu, bir de görək, nə istəyirsən? – Deyim də: .. boğazaltı, belbağı, iki dəst qızıl qolbaq, on dəst üzük...* H.Sarabski. *Sənəm sumağı boğazaltısının uclarını yoğun hörüyünün altına düyünləmişdi.* Ə.Əbülhəsən.

4. Yüyəndə: atın boğazının altından keçib başına bağlanan qayış. *Yüyənin boğazaltısı qırılmışdır.*

**BOĞAZDÖYÜŞMƏSİ** b a x **boğazadöymə.**

**BOĞAZLAMA** "Boğazlamaq"dan *f.is.*

**BOĞAZLAMAQ** *f.* 1. Boğazından yapışmaq (tutmaq, yaxalamaq). *Vəznəli kişi qorodovoylara qışqırdı, tez məhkumu boğazladılar.* Mir Cəlal.

2. Boğazını kəsmək, boğazını üzmək, boğmaq. *Tülkü toyuğu boğazladı.*

**BOĞAZLANMAQ** *məch.* 1. Boğazından tutulmaq, yaxalanmaq. [Şeyda:] *Bu gün Yusiflə Musanın boğazlandığını görüb də qoyun sürüsü kimi kənardan seyr edirsiniz.* H.Cavid.

2. Boğazı kəsilmək, boğazı üzülmək, boğulmaq.

**BOĞAZLAŞMA** "Boğazlaşmaq"dan *f.is.*

**BOĞAZLAŞMAQ** *qarş.* Bir-birinin boğazından yapışmaq, dalaşmaq.

**BOĞAZLI** *sif.* Boğazı olan. *Boğazlı qab. Boğazlı şüşə. Boğazlı çəkmə. Boğazlı qaloş.*

**BOĞAZLIQ¹** *is.* 1. Boğaza sarınan şal və ya boğaza keçirilən qadın zinəti.

2. Paltarın boyun tərəfi. *Onun köynəyinin ancaq boğazlığı salamat qalmışdı.* S.Rəhimov. *Gəldiyev əlini boğazlığına atdı, düzəltdi.* Mir Cəlal.

3. Çəkmə boğazına yarar dəri və s.

**BOĞAZLIQ²** *is.* Qarnında balası olma, hamiləlik. *Qarabağ madyanlarında boğazlıq dövrü.*

**BOĞÇA** *is.* İçinə dəyişək, parça və s. qoyulub bükülmüş bağlama (böyük yaylıq). [Atam anama dedi:] *Hərgah getmək istəyirsənsə, dur ayağa, boğçanı aç, mənim paltarlarımdan bir dəst gey, gedək.* H.Sarabski. *Səriyyə xala geri qayıtdı, onun qoltuğunda yamaqlı bir boğça var idi.* M.İbrahimov.

◊ **Boğçaya qoymaq** *məc.* – üstünü örtmək, malalamaq, üstünü açmamaq.

**BOĞÇALAMA** "Boğçalamaq"dan *f.is.*

**BOĞÇALAMAQ** *f.* Boğçaya bükmək, boğça şəklində bağlamaq.

**BOĞÇALANMA** "Boğçalanmaq"dan *f.is.*

**BOĞÇALANMAQ** *məch.* Boğça şəklində bağlanmaq, boğçaya qoyulub bağlanmaq.

◊ **Paltarı boğçalanmaq** – ölmək. *Qızılgül axçalandı; Dərmədim axçalandı; Sənə kimlər qarğadı; Paltarın boğçalandı.* (Bayatı).

**BOĞDURMA** "Boğdurmaq"dan *f.is.*

**BOĞDURMAQ** "Boğmaq"dan *icb.* [Hacı Səməd xan:] *Həyasızın birisi, deyəsən, bizim Təbrizdə adam boğdurmaqdan başqa bir işimiz yox imiş.* M.S.Ordubadi. [Xan:] *Bu Əbdilqədir .. Şəkiyə hücum edib, qardaşı oğlu Hüseyn xanı boğdurub, yerində oturdu..* Çəmənzəminli.

**BOĞMA** *is.* 1. "Boğmaq"dan *f.is.*

2. Yoluxma boğaz xəstəliyi (xalq arasında difteritin adı). Boğma çıxarmaq (boğma xəstəliyinə tutulmaq).

3. *məc. dan.* Yemək, xörək, çörək mənasında (nifrət, hiddət və acıqla deyilir). [Fatma xanım:] *Get, boğma bişir, zəhər bişir .. yaxşımı?* N.Vəzirov.

4. *sif.* Ortası dar, ağız və alt tərəfi isə gen (qab, stəkan və s. haqqında). *Nurcahan qarpızı samovarın qabağında oturub, güllü boğma stəkanları silirdi.* S.Rəhimov.

◊ **Boğma çıxarmaq** – qarğış əlaməti olaraq iki əlini qabağa gətirərək yumruq göstərmək. *Fatma xanım ikiəlli İsgəndərə boğma çıxardıb gedir.* C.Məmmədquluzadə.

**BOĞMACA** *is.* bax **boğma** 2-ci mənada.

**BOĞMAQ** *f.* 1. Boğazı sıxmaqla nəfəs yolunu, nəfəsini kəsmək. *Boğazından yapışıb boğmaq. Boyunduruq öküzün boynunu boğur.* – [Bayram:] *Yüyürdüm yanına, gördüm ki, bir ayı bir adamı boğur, tüfəng atıb ayını vurdum, yaraladım.* M.F.Axundzadə. *Baba qollarını ata-ata yenə danışmaq istədi, lakin öskürək onu boğdu.* Çəmənzəminli. *Arvadı hıçqırıq boğdu.* M.İbrahimov. *Ağlamaq məni boğdu.* Mir Cəlal. // Nəfəs almağı çətinləşdirmək, nəfəs almağa qoymamaq. *Buranın havası adamı boğur.*

2. Boğub öldürmək. Çaqqal toyuqları boğdu. – [Rəsul:] *Kişi məni boğmağa gətirib.* N.Vəzirov. // Suya batırıb öldürmək. *Küçüyü suya atıb boğmaq.*

3. Əl, ip və s. ilə sıxmaq. *Çuvalın ağzını boğmaq. Borunun bir tərəfini boğ, su axmasın.* // Tarım çəkmək, bağlamaq, sarımaq. [Göyərçin] *gümüş kəmərini açaraq, bir az daraltdı və belini boğdu.* S.Rəhimov.

4. *məc.* Yolunu daraldaraq suyunu azaltmaq (arxın).

5. *məc.* İnkişaf etməyə, yayılmağa, güclənməyə qoymamaq; qabağını almaq. *Azadlığı boğmaq. – Çar hökuməti 1905-ci il inqilabını boğmaq məqsədi ilə ermənilərlə müsəlmanlar arasında milli qırğın üçün bir zəminə hazırladı.* M.S.Ordubadi. // *məc.* Yatırtmaq, məhdudlaşdırmaq, üzə çıxmasına, görünməsinə, eşidilməsinə mane olmaq. [Əlyarov] *hirsini boğub, səsinə mülayim bir ahəng verdi.* M.Hüseyn. *Amma .. Nadir ürəyinin tələbini boğub, öldürüb fürsətdən istifadə etmədi...* B.Talıblı. *İsfahani təzəcə yaralanmış ayı kimi qəzəbini boğa bilmədi...* M.İbrahimov.

6. *məh.* Xam atı öyrətmək, sakitləşdirmək, ram etmək.

**BOĞMALAMA** "Boğmalamaq"dan *f.is.*

**BOĞMALAMAQ** *f.* 1. Yavaşca, yüngülvari boğmaq, sıxışdırmaq.

2. *dan.* Qarğış etmək, nifrin etmək, qarğımaq.

3. *vulq.* Yedirtmək, bir şey vermək. (yeməyə). // *vulq.* Yemək, udmaq, içəri ötürmək. *Bu da sözdürmü, qazandıqlarımız parələri; Hey verək boğmalasın Zəngəzur avarələri?* M.Ə.Sabir. [Fatma xanım:] *Apar boğmalan, .. mən həmişə çay içənlərdən deyiləm.* N.Vəzirov.

**BOĞMALANMA** "Boğmalanmaq"dan *f.is.*

**BOĞMALANMAQ** *f. vulq.* Tez-tez və acgözlüklə yemək.

**BOĞMALIQ** *is. vulq.* Yemək, xörək (nifrət və acıqla deyilir). *Əlbəttə, Talıb xana cüzi bir boğmalıq vermək, bu var-yoxun hamısını verməkdən çox-çox asan idi.* S.Rəhimov.

**BOĞUCU** *sif.* 1. Tənəffüsü çətinləşdirən, boğan. *Boğucu tüstü. Boğucu hava. – Kərimbəy qapını açanda, ağır və boğucu isti hava onu vurdu.* Mir Cəlal.

2. Nəfəs yollarını zəhərləyən. *Boğucu qaz.*

**BOĞUCULUQ** *is.* Boğucu şeyin xassəsi.

**BOĞUQ** *sif.* 1. Boğulmuş. *Boğuq barama* (*qurdları boğulmuş barama*). *Ağzı boğuq çuval* (*ağzı iplə boğulmuş çuval*).

2. Aydın olmayan, aydın eşidilməyən, ahəngdar olmayan; tutqun, zəif. *Dünyanı görməyirsən ki... deyən, rəfiqini boğazında tıxılan boğuq bir səda ilə salamladı.* M.Ə.Sabir. *Dərədən boğuq bir səs eşitdim, ildırım sürəti ilə dərəyə atıldım.* A.Şaiq. *..Söyüdlü dərənin sonundan boğuq bir gurultu gəlirdi.* Ə.Məmmədxanlı. *Meşədə boğuq bir güllə səsi eşidildi.* M.Hüseyn.

**BOĞUQLUQ** *is.* Boğuq şeyin halı. *Səsin boğuqluğu.*

**BOĞULMA** "Boğulmaq"dan *f.is.*

**BOĞULMAQ** *f.* 1. Hava azlığından nəfəsi çətinləşmək, nəfəs ala bilməmək. *İstidən boğulmaq. Bu otağın havası yoxdur, adam boğulur. Dağa qalxdıqca boğulurdum.*

2. Nəfəs ala bilməmək nəticəsində ölmək (tüstüdən, boğucu qazdan və s.). *Tüstüdən, az qala boğulmuşdum.*

3. Suda qərq olmaq, batmaq. *Dənizdə boğulmaq. Çayda boğulmaq.*

4. *məc.* Məhv olmaq, tələf olmaq, yox olmaq, qeyb olmaq. *Görürəm ilk dəfə ulduzun, Ayın; Alovlar içində boğulduğunu...* S.Vurğun.

5. *məc.* Son dərəcə sıxıntı, təzyiq, mənəvi və cismani əzab hiss etmək. *Yazıqda qalmayır taqətdən əsər; Boğulur qəfəsdə bir bülbül kimi.* S.Vurğun.

6. *məc.* Bir şeyin çoxluğunu, ağırlığını, güclülüyünü, üstünlüyünü bildirir. *Ətraf qəmgin bir sükut içində boğulurdu.* M.Hüseyn.

**BOĞULMUŞ** *f.sif.* 1. Boğulub öldürülmüş. *Qafqazlının boğulmuş meyiti küçəyə atılmışdı.* M.S.Ordubadi.

2. Havasızlıqdan, yaxud tüstüdən, qazdan ölmüş.

3. Suda qərq olmuş. *Çayda boğulmuş adam. – Ciğato çayı minlərlə .. boğulmuş mal-qara cəmdəklərini axıdıb, Urmu gölünə aparırdı.* M.S.Ordubadi.

**BOĞULTU** *is.* Boğulan adamın, yaxud heyvanın çıxardığı səs. *Xırıltı, boğultu və ayaq səsləri ağır bir çarpışma getdiyini bildirirdi.* M.İbrahimov.

**BOĞUNUQ** b a x **boğuq.** *Mən bir oğrunun boğunuq və yavaş səsinə bənzəyən bir səs eşitdim.* M.S.Ordubadi.

**BOĞUŞDURMA** "Boğuşdurmaq"dan *f.is.*

**BOĞUŞDURMAQ** *icb.* Bir-biri ilə dalaşdırmaq, savaşdırmaq, vuruşdurmaq. [Avam camaat] *Bakının ətraf kəndlərindən məşhur cins qoyun itlərini küçüklüyündən Bakıya gətirib il yarım, iki il bəsləməyə başlar və boğuşdurmaq üçün hazırlaşdırardılar.* H.Sarabski.

**BOĞUŞMA** 1. "Boğuşmaq"dan *f.is.*

2. *is.* Savaşma, dalaşma, çeynəşmə; dava, mübahisə, qovğa. [Kazım:] *Bu xanların boğuşması qurtarmır ki, biz də bir gözümüzü açaq, dünyanın işığına baxaq.* Çəmənzəminli.

**BOĞUŞMAQ** *qarş.* 1. Bir-birini qapmaq. *İtlər boğuşurlar. – İt itlə boğuşdu, yolçuya fürsət düşdü.* (Ata. sözü).

2. Dalaşmaq, savaşmaq, vuruşmaq, dava etmək. *Küçədə uşaqlar boğuşurdular. – Ayı bir müddət onlar ilə boğuşandan sonra, mağaradan sıçrayıb çıxdı.* S.S.Axundov. *Bir gün Əşrəf məhəllə uşaqlarından biri ilə boğuşarkən, ağır bir əl qollarından yapışdı.* A.Şaiq.

**BOKS** [*ing.*] *idm.* Əllərə xüsusi əlcəklər geyilərək müəyyən üsul və qayda ilə icra edilən yumruq döyüşündən ibarət idman növü.

**BOKSÇU** *is. idm.* Boksla məşğul olan idmançı.

**BOKSİ́T** [*fr.*] Alüminium hasil edilən əsas filiz.

**BOKSYÓR** [*ing.*] b a x **boksçu.**

**BOL** *sif.* Çoxlu, son dərəcə çox, həddən artıq. *Bol meyvə. Bol məhsul. Çayda bol su var. Bol süd verən inək. – Sentyabr ayı Bakıda əncirin, üzümün bol olan ayıdır.* S.Rəhman. *İndi babalarımızın "ilan mələyən" dedikləri çöllərə bol su axır.* İ.Əfəndiyev.

**bol-bol** *zərf* 1. Çox, çoxlu, artıq, həddən artıq. *Məndən ona bol-bol salam söylə.*

2. Artıqlaması ilə. *Bu taxıl bizi bol-bol görər.*

**BOLERÓ** [*isp.*] *mus.* 1. İspan milli rəqslərindən birinin adı.

2. Bu rəqs tempində bəstələnmiş musiqi əsəri.

**BOLQÁR** *is.* Şərqi Slavyan xalqlarından biri və bu xalqa mənsub adam.

**BOLQARCA** *zərf* və *sif.* Bolqar dilində. *Bolqarca danışmaq. Bolqarca-rusca lüğət.*

**BOLLANMA** "Bollanmaq"dan *f.is.*

**BOLLANMAQ** *f.* Bol olmaq, xeyli çoxalmaq, artmaq. *Bazarda ət və tərəvəz bollanmışdır. Çayın suyu bollanmışdır.*

**BOLLAŞDIRILMA** "Bollaşdırılmaq"dan *f.is.*

**BOLLAŞDIRILMAQ** *məch.* Bol edilmək, çoxaldılmaq, miqdarı daha da artırılmaq.

**BOLLAŞDIRMA** "Bollaşdırmaq"dan *f.is.*

**BOLLAŞDIRMAQ** *f.* Bol etmək, çoxaltmaq, miqdarını daha da artırmaq. *Məhsulu bollaşdırmaq.*

**BOLLAŞMA** "Bollaşmaq"dan *f.is.*

**BOLLAŞMAQ** b a x **bollanmaq.** *Mağazalarda hər şey bollaşmışdır.*

**BOLLATMAQ** b a x **bollaşdırmaq.**

**BOLLU** b a x **bol.** *Çayda bollu su var. Göldə bollu balıq var. Bu il bollu meyvə götürmüşük.*

**bollu-bollu** *zərf* Bol-bol.

**BOLLUCA** *zərf* Çox bol, çoxlu. *Sanatoriyada bolluca yemək verirlər. Bolluca vədə vermək. –* [Bacı:] *Ona yemək vermə, içmək vermə, bolluca nağıl söylə.* S.S.Axundov. [Həkim:] *Onları öz tərəfimizə çəkib yoldaş eləmək üçün də bolluca vaxt lazımdır.* M.Hüseyn.

**BOLLUQ** *is*. 1. Çoxluq, artıqlıq. *Məhsulun bolluğu. Çayda suyun bolluğu. Xammalın bolluğu*.

2. Firavanlıq, rifah. *Bolluq içində yaşamaq. Sərgidəki hər şey bolluqdan, şadlıqdan və böyük əməkdən danışırdı.*

**BOLŞEVÍK** [*rus.*] Bolşevizm tərəfdarı. *On iki minlik bolşevik "Qırmızı qvardiya"sının 70 faizini də daşnaklar təşkil edirdi...*

**BOLŞEVÍZM** [*rus.*] V.İ.Lenin tərəfindən hazırlanaraq rus və beynəlxalq miqyasda fəhlə sinfinin mübarizəsi təcrübəsinə əsaslanan proletar inqilabı hərəkatı haqqında nəzəriyyə və taktika.

**BOLT** [*rus.*] Maşın və s. hissələrini bir-birinə bənd etmək üçün bir başına qayka keçirilən metal ox. *Özülün üstündə qurulmuş dirəklər yoğun boltlar və dəmirlərlə bir-birinə möhkəm bağlanmışdı.* M.Süleymanov.

**BOLTLAMA** "Boltlamaq"dan *f.is.*

**BOLTLAMAQ** *f.* Bolt ilə birləşdirmək, boltla bir-birinə bağlamaq.

**BOLTLANMAQ** *məch*. Bolt ilə birləşdirilmək, bolt ilə bir-birinə bağlanmaq.

**BOMBÁ** [*fr.*] İçərisinə partlayıcı maddələr doldurulub, əl və ya silah vasitəsilə, yaxud da təyyarədən atılan mərmi, qumbara. *Atom bombası. Oksigen bombası. Yandırıcı bomba. Fuqas bombası.*

**BOMBAÇI** *is.* 1. Bomba hazırlayan, bomba qayıran (adam).

2. Bomba atan, bombardmançı.

**BOMBAÇILIQ** *is.* Bomba hazırlama sənəti. [Həsən isə] *öz rəğbəti ilə bombaçılıq vəzifəsini görürdü.* M.S.Ordubadi.

**BOMBADAŞIYAN** b a x **bombardmançı** 1-ci mənada. *Bombadaşıyan təyyarələr ildırım kimi şığıyan qırıcı təyyarələrin müşayiəti ilə əsgərlərin başı üstündən ötüb keçdi.* M.S.Ordubadi.

**BOMBALAMA** "Bombalamaq"dan *f.is.* *Qabaq düşmən idi, arxa isə hər gün davam edən bombalama nəticəsində dağılırdı.* Mir Cəlal.

**BOMBALAMAQ** *f.* Havadan hücum edərək bombaya basmaq, üzərinə bomba atıb dağıtmaq.

**BOMBALANMA** "Bombalanmaq"dan *f.is.*

**BOMBALANMAQ** *məch*. Bombaya basılmaq, bomba ilə vurulmaq, üzərinə bomba atılıb dağıdılmaq.

**BOMBALATMAQ** *icb*. Bombaya basdırmaq.

**BOMBARDMAN** b a x **bombardmançı** 1-ci mənada. *Bombardman təyyarəsi.* ☐ **Bombardman etmək** – b a x **bombalamaq.**

**BOMBARDMANÇI** 1. *sif.* Bombalamaya məxsus. *Bombardmançı təyyarə.*

2. *is.* Bombardman təyyarəçisi. *Hava ayaz deyildi ki, bombardmançılar onsuz da qalxıb dağım-dağım olan yeri təzədən şumlamağa başlasın.* Ə.Əbülhəsən.

**BOMBATÖKƏN** b a x **bombardmançı.** *Gedir qərbə tərəf hücum çəkənlər; Gedir qatar-qatar bombatökənlər.* M.Rahim.

**BOMBOŞ** *sif.* və *zərf* Tamamilə boş, lap boş, içində heç bir şey olmayan. *Bomboş otaq.* – [Tarverdi:] *Görəsən sövdəgər tayfası yaraqlı-əsbablı yola çıxır, ya elə bomboş?* M.F.Axundzadə. *Şikayətçilər kabinetin bomboş olduğunu görərək, dönüb bir-birinin üzünə mat-mat baxdılar.* S.Rəhimov. *Anasının hər zaman bəzəkli saxladığı bu otaq bomboş idi.* S.Rəhman.

**BOMBOZ** *sif.* Tünd boz rəngli. [Lado] *Lökbatan adlanan bomboz bir səhra ilə qarşıda görünən dağlara sarı gedirdi.* S.Rəhman. *..Qulam təpədən-dırnağa bomboz idi.* Ə.Əbülhəsən. ☐ **Bomboz bozarmaq** – tamamilə boz rəng almaq, rəngi qaçmaq. *Bayram indi bomboz bozardı.* Ə.Vəliyev.

**BOMJ** *is.* [*rus.*] Səfil, didərgin, yeri-yurdu olmayan adam.

**BON** [*fr.*] 1. Sahibinə müəyyən vaxtda və müəyyən idarədən üzərində göstərilən məbləği almaq üçün ixtiyar verən kredit sənədi.

2. Adətən yerlərdə buraxılan müxtəlif müvəqqəti kağız pulların adı.

**BONAPARTÍST** [*xüs. is.*-dən] Bonapartizm tərəfdarı.

**BONAPARTÍZM** [Fransa imperatoru Bonapartın adından] İnqilab şəraitində iri burjuaziyanın diktatura formalarından biri; bu şəraitdə hərbçilərə istinad edən əks-inqilabçı hökumət bir-biri ilə mübarizə edən sinifləri aldadaraq, özünü partiyalar üstündə olan bir hakimiyyət kimi qələmə verməyə çalışır.

**BONUS** *is.* [*lat.*] Mükafat, muzd, haqq, bəxşiş.

**BOR**[1] [*lat.*] *kim.* Bir neçə mineralın tərkibinə daxil olan tünd boz rəngli kimyəvi element. □ **Bor turşusu** *kim.* – dezinfeksiya və s. üçün işlədilən suda əriyən rəngsiz kristallar.

**BOR**[2] [*alm.*] *tib.* Diş müalicəsində işlədilən polad burğu.

**BORAN** *is.* Küləkli qar və yağış; çovğun, qasırğa. *Borana düşmək. – Kərəməli, yollarım toz, qubar oldu; Boran oldu, çovğun oldu, qar oldu.* Aşıq Kərəm. *Bunların* [Xədicə və uşaqların] *ah-naləsi, boranın gurultulu səsi bir-birinə qarışmışdı.* S.S.Axundov. *Qabaqdan ağ geyib gəlir qara qış; İstinin soyuğu, boranı varmış.* S.Vurğun. // Boranlı hava. [Yarpız] *qışın boranında çıxıb qapıda dururdu ki, Bəndalı ötəndə boyuna baxsın.* Mir Cəlal. // *məc.* Müsibət, fəlakət, bəla mənasında. *Başından min boran keçmiş, dəyişmiş qanlı dövranlar.* S.Vurğun. [Xavər] *bağrına basdığı balasını həyatın fırtına və boranlarından qorumaq yollarını axtarırdı.* M.İbrahimov.

**BORANI** *is.* 1. *bot.* Qabaq növü. *Ağ boranı. Sarı boranı.* – [Pası] *evin qabağında olan çiçəkli tənbəkilərə, saralıb qızaran boranılara baxmağa gedərkən, Cəbi Gülsənəmin yanına qaçdı.* S.Rəhimov.

2. *aşp.* Boranıdan bişirilən yemək.

**BORANLAMA** "Boranlamaq"dan *f.is.*

**BORANLAMAQ** *f.* 1. Boran qalxmaq, boran baş vermək. *Hava boranladı.*

2. Borana düşmək, boranlı havada soyuqdan donmaq. *Mallar çöldə qalıb boranlamışdılar.*

**BORANLI** *sif.* Küləkli qar və ya yağışlı; bərk küləkli, qasırğalı. *Boranlı hava. Boranlı qış günü. – Duman gəldi, azdım mən də yolumu; Çiskinli, boranlı çöllərdə qaldım.* Aşıq Kərəm. *Payız çatanda axıra boranlı, qarlı qış yetər.* A.Səhhət. *Boranlı qış gecəsi, şaxta şiddət ilə kəsir; Külək vıyıldayaraq səs salır biyabanə.* C.Cabbarlı.

**BORANLIQ** b a x **boran.** *Atasız tifilləri basdı boranlıq, bizə nə; Tapmayır ac-yalavaclar güzəranlıq, bizə nə?* M.Ə.Sabir.

**BORC** *is.* 1. Qaytarılmaq şərti ilə birindən alınan, ya birinə verilən pul və sairə; alacaq, verəcək. *Borc pul verənin dili uzun olar.* (Ata. sözü). [Molla Qasım:] *Toyuq, ördək, qax, qoz ki vardır... Bunlardan gətirin, borclarınıza hesab edək..* S.S.Axundov. □ **Borc almaq** – qaytarmaq şərti ilə birindən bir şey və ya pul almaq. **Borc etmək** – borc olaraq birindən pul və ya başqa şey almaq. [Axund:] *Buna xatircəm olub min manatadək borc eləmişəm.* Ə.Haqverdiyev. **Borc vermək** – qaytarmaq şərti ilə birinə bir şey və ya pul vermək. **Borca düşmək (batmaq, girmək)** – çoxlu borc etmək, ondan-bundan çoxlu borc almaq. **Borca salmaq** – borca düşməsinə, özündə olmadığı üçün başqasından borc almasına səbəb olmaq. **Borcdan qurtarmaq (çıxmaq)** – bütün borclarını verib qurtarmaq. **Borcunu vermək** – 1) almış olduğu borcu geri qaytarmaq. [Məşədi Əsgər] *xozeyindən aldığı puldan səkkiz manat iki abbası qonşu dükançının borcunu verdi.* S.M.Qənizadə; 2) *məc.* vəzifəsini, borcunu yerinə yetirmək.

2. Ödənilməmiş vergi və s. *Vergi borcları.*

3. Vəzifə. [Süleyman bəy:] *Sən mənim atamsan və sənə hörmət eləmək mənim borcumdur.* Ə.Haqverdiyev. □ **Borc bilmək** – özünə vəzifə hesab etmək. *Ancaq* [Heybət] *sarsılmaz bir vəziyyətdə, qarşısında duran Şamoya cavab verməyi özünə borc bildi.* S.Rəhimov. **Borc olmaq** – vəzifə olmaq, ödənilərsi lazım gəlmək, üzərinə vəzifə qoyulmaq. *Borc olsun, əvəzini çıxarıq.*

4. Haqq, minnət. *O mənə çox yaxşılıq edib, mənim ona çox borcum var.* □ **Borcdan çıxmaq** – əvəzini vermək, minnətdən çıxmaq, qarşılığını vermək.

◊ **Nə borcum(a), nə borcun(a), nə borcumuzdur (borcundur)** – mənə (sənə) dəxli yoxdur, mənə (sənə) aid deyil, mənim işim (sənin işin) deyil, nə işimə (nə işinə). *A qardaşlar, mənim nə borcumdu ki, məvacibiniz az, zəhmətiniz həddən artıq və rahətliyiniz əbədən yoxdur.* C.Məmmədquluzadə. *Xoş keçmədi il çöllüyə, dehqanə, nə borcum; Yağmadı yağış, bitmədi bir danə, nə borcum.* M.Ə.Sabir. [Fatma xanım:] *Sənin ha qardaşın alıb gətirməyib, mənim oğlum gə-*

*tirib. Sənin nə borcun?* N.Vəzirov. [Hacı İsfahani:] *Nə borcuna nə düşünürəm, sən de görüm, niyə gəlmisən?* M.İbrahimov. **Borcun(a), borcum(a) deyil, sənə (mənə) borc deyil** – b a x **nə borcum(a)**. ..[Güləndam:] *De ki, sənin borcun deyil, .. vaxtını mən özüm gələrəm, deyərəm.* N.Vəzirov [Qarı:] *Gec gəldim, .. birisi gün gəldim, borcuna deyil.* Ə.Əbülhəsən.

**BORC-XƏRC** *is.* b a x **borc** 1-ci mənada. *Aslan borc-xərc pul düzəldib* [Fərhadı] *Kiyevə instituta göndərdi.* C.Cabbarlı. *Öz borc-xərcini verəndən sonra* [Qulamın] *cibində dörd yüz manat dəxi qalmışdı.* S.Rəhimov. ☐ **Borc-xərc eləmək** – başqasından borc almaq.

**BORCLU** *sif.* və *is.* 1. Borcu olan, başqasından borc almış olan; verəcəkli. *Borcluların siyahısını tutmaq. – Güllücədə Molla Qasıma borclu olmayan bir kəndli yox idi.* S.S.Axundov.

2. Borc verən. *Borclu borclunun sağlığını istər.* (Məsəl).

3. Bir vəzifəni görməli olan, öz vəzifəsi kimi icra etməli olan; vəzifəli. *O, gördüyü işlər haqqında vaxtında hesabat verməyə borcludur. O, sənin işini görməyə borclu deyil.* ☐ **Borclu çıxartmaq** – b a x **borclu eləmək.** [Qəhrəman:] *"Sağ ol" demək əvəzinə, məni borclu çıxarırsan.* S.Rəhimov. **Borclu eləmək** – yaxşılıq qarşısında minnətdar etmək. *Məni özünə borclu elədi.* **Borclu qalmaq (olmaq)** – öhdəsində borc olmaq.

**BORCLULUQ** *is.* Borclu olma, borclu adamın halı. *Borcluluq adamı narahat edir.*

**BORDAQ** *k.t.* 1. *sif.* Bəslənmiş, yaxşı yedirilib kökəldilmiş, kök (ev heyvanları haqqında). ☐ **Bordağa bağlamaq, bordaqda saxlamaq** – yemləyib kökəltmək. *Malqaranı çöldə və bordaqda kökəltmək işinin düzgün təşkil edilməsi ümumi ət istehsalını artırmaq üçün mühüm mənbədir.* (Qəzetlərdən). **Bordaq dövrü** – heyvanların bu vəziyyətdə saxlandığı dövr.

2. *is.* İri heyvanların başıbağlı saxlanması üçün tövlədə, pəyədə kiçik mənzil.

**BORDAQLAMA** "Bordaqlamaq"dan *f.is.*

**BORDAQLAMAQ** *f.* Bordağa bağlamaq (b a x **bordaq**).

**BORDAQLANMAQ** *məc.* Yaxşı yedirilib kökəldilmək, bəslənmək (ev heyvanları haqqında).

**BORDÜR** *is.* [*fr.*] 1. Haşiyə; divarın döşəmə ilə birləşən yerinə vurulan haşiyə.

2. Yolların kənarını bildirən ağ və qara rəngli dirəklər.

**BORJÓM** [Gürcüstanda yer adından] Müalicə üçün işlədilən mədən suyu. *Borjom suyu.*

**BORMAŞÍN** *xüs.* Dişlərin içini ovmaq, təmizləmək üçün diş həkimlərinin işlətdiyi burğu maşını.

**BORŞ** [*rus.* борщ] Kələm, çuğundur və başqa göyərtidən bişirilən şorba; kələm şorbası. [Vəli bəy:] *Canım, Allahın kələm suyu borşu istəyirsən, içindən sosiska çıxır.* S.S.Axundov.

**BORŞLUQ** *sif.* Borş üçün yarayan. *Borşluq kələm. Borşluq ət.*

**BORT** [*fr.*] 1. Gəminin yan divarı, böyrü; yük avtomobilinin kuzovunun və yük qatarının açıq vaqonlarının yan divarı..

2. Bilyard mizinin və s.-nin üst yanı, kənarı.

**BORTMEXÁNİK** [*xar.*] Təyyarədə, dirijablda motorların, cihazların, aparatların işləməsinə və vəziyyətinə məsul olan təyyarə mexaniki.

**BORU** *is.* 1. Dəmirdən, çuqundan, saxsıdan, şüşədən və s.-dən qayrılan uzunsov lülə şəklində içiboş cisim. *Su borusu. Qaz borusu. Neft borusu. Rezin boru. Müşahidə borusu* (optik cihaz). *Borularda neft fasilə vermədən axır.* // Baca. *Zavod borularından burula-burula tüstü çıxır*. (Qəzetlərdən).

2. Nəfəslə çalınan, gurultulu səs çıxaran musiqi aləti. *Boru çalmaq.*

3. *anat*. Bədən üzvlərini bir-biri ilə əlaqələndirən kanal. *Nəfəs borusu. Qida borusu. Tənəffüs borusu.*

**BORUCUQ** *is.* Kiçik boru.

**BORUDÜZƏN** *is. xüs.* Boruları yan-yana düzüb birləşdirən işçi. *Borudüzən* [Mikayılov] *gündəlik tapşırığı daim artıqlaması ilə yerinə yetirir.* (Qəzetlərdən).

**BORUƏYƏN** *is. tex.* Boruları əyməyə məxsus alət.

**BORUKƏSƏN** *is. tex*. Boruları kəsmək üçün alət. *Qoruyucu boruları quyuda kəsmək üçün daxili borukəsən işlədilir.* Quliyev.

**BORULU** *sif.* Borusu olan.

**BORUSIXAN** *is. tex.* Borunu sıxıb tutmaq üçün alət.

**BORUŞƏKİLLİ** *sif.* Görünüşcə boruya oxşayan, boru kimi. Boruşəkilli cisim.

**BORUVAR(İ)** b a x **boruşəkilli.** *Boruvari çiçək bot.*

**BÓSMAN** *is.* [*holl.*] *dəniz.* Gəmi komandasının, təsərrüfat işləri cəhətdən tabe olduğu şəxs.

**BOSMANLIQ** *is.* Bosmanın işi, vəzifəsi.

**BOSTAN** *is.* [*fars.*] Qovun, qarpız, xiyar, badımcan kimi tərəvəz bitkiləri yetişdirilən yer.

**BOSTANÇI** *is.* Bostançılıqla məşğul olan adam, bostan yetişdirən adam. *Bostançının sovqatı kəlik olar.* (Ata. sözü).

**BOSTANÇILIQ** *is.* Bostan işi ilə məşğul olma, bostançı peşəsi, bostan bitkiləri yetişdirmə işi. *Bostançılıqla məşğul olmaq.*

**BOSTANLIQ** *is.* Bostan salınmış yer, başdan-başa bostan. *Dəmiryol boyu bostanlıq idi.* // *sif.* Bostan üçün yararlı. *Bostanlıq yer.*

**BOSTAN-TƏRƏVƏZ** b a x **bostan.**

**BOSTÓN** [*coğrafi addan*] Əla yundan toxunma parça növü. *Boston parça.* // Bu parçadan tikilmiş. *Boston kostyum.*

**BOŞ** *sif.* və *zərf* 1. İçində heç nə olmayan. *Boş qutu. Boş dükan. Boş çamadan. Boş şüşə. – Boş çuval dik durmaz.* (Ata. sözü). □ **Boş əl ilə** *məc.* – heç bir şey əldə etmədən, heç bir şeyə nail olmadan, əlində heç bir şey olmadığı halda. *Boş əl ilə üstümüzə gəldi.* // Yüklənməmiş, içində yükü, miniyi olmayan. *Boş araba. Boş vaqon. – Boş eşşək yeyin gedər.* (Məsəl). // Puç, içində ləpəsi olmayan. *Boş qoz. Boş fındıq.* // Heç kəs tərəfindən tutulmamış, azad, sahibsiz. *Boş yer. Boş vəzifə. – Otaq dolu idi, boş kürsü yox idi.* M.S.Ordubadi. // Doldurulmamış, gülləsiz. *Boş patron. Boş tüfəng.*

2. Həlli çətin olmayan, çox sadə, asan. *Boş iş. Boş məsələ. Boş bir şey.*

3. *məc. dan.* Ərsiz, ərindən ayrılmış, əri ilə əlaqəsini kəsmiş. [Fazil:] *Bir kişi ki dəli oldu, onun övrəti ondan boşdu.* C.Məmmədquluzadə.

4. Bihudə, əbəs, hədər, əsassız, əsli olmayan. *Boş söhbət. Boş ümidlər. Boş zəhmət çəkirsən. – Boş danışıqdan nə çıxar, ay balam.* M.Ə.Sabir. □ **Boş danışmaq (söyləmək)** – cəfəng danışmaq, bihudə danışmaq, əbəs danışmaq, əsassız danışmaq, yersiz danışmaq. [Səkinə xanım:] *Bibim boş söyləyibdir, kimdir onun sözünə baxan.* M.F.Axundzadə. *Mən ölüm, Molla Nəsrəddin, hələ onu sonra oxursan, sənin İbrahim bəyin boş danışır.* C.Məmmədquluzadə. **Boş yerə** – 1) əbəs, nahaq. *Boş yerə cavab vermədin;* 2) səmərəsiz, faydasız, hədər. *Vaxtı boş yerə keçirdin.* **Boşa çıxarmaq** – heçə çıxarmaq, puça çıxarmaq, heç eləmək, nəticəsiz qoymaq. *Açıq demək lazımdır ki, kazak briqadası İran hökumətinin ümidlərini boşa çıxardı.* M.S.Ordubadi. **Boşa çıxmaq** – boş olmaq, puç olmaq, hədər getmək, heç bir nəticə çıxmamaq. *Bütün səylər boşa çıxdı. Ümidlər boşa çıxdı.* **Boşa getmək** – b a x **boşa çıxmaq**. **Əli boşa çıxmaq** – b a x **boşa çıxmaq**.

5. Asudə, azad, bikar, işsiz, işi olmayan. *Boş vaxt. Boş vaxtımda sizə gələrəm.* □ **Boş durmaq (oturmaq)** – heç bir işlə məşğul olmamaq, işsiz dayanmaq, işləməmək.

6. Yumşaq, məsamələri bir-birinə zəif yapışmış (*bərk* müqabili). *Boş ağac. Boş torpaq. Boş qənd* (tezəriyən qənd). // Sıyıq, duruhal. *Boş xəmir. Boş palçıq.* // Qəliz olmayan, tünd olmayan, zəif.

7. Ölçüsündən böyük. *Ayaqqabı ayağıma boş olur.*

8. Zəif bağlanmış, tarım olmayan, kip bağlanmamış, dartılmamış. *Atın yəhəri boşdur, onu bərkitmək lazımdır.*

9. Qabırğaların alt tərəfində olan. *Boş əti.*

10. *məc.* Məzmunsuz, mənasız, faydasız, qeyri-ciddi, yüngül. *Boş kitab. Boş əsər. Boş məqalə.*

11. *məc.* İradəsiz, dayanıqsız, yüngül, ciddiyyətsiz. *Boş adam.* □ **Boş tutmaq** – ciddi baxmamaq, ciddi yanaşmamaq, laqeydlik göstərmək, əhəmiyyət verməmək.

**boş-boş** *zərf* Mənasız, havayı, əbəs, nəticəsiz. *Boş-boş danışmaq.* – [Heydər bəy:] *Boş-boş xəyal eləmə, bu heç vaxt olmaz!* M.F.Axundzadə. [Cavan:] *Balam, boş-boş danışmaqdan fayda yoxdur.* Ə.Haqverdiyev. // İşsiz-gücsüz, heç bir iş görmədən, veyil-veyil. [Mirpaşa:] *Mahmud .. başlayıb tənbəlliyə, boş-boş gəzib tütək çalmağa.* Z.Xəlil.

**BOŞALDILMA** "Boşaldılmaq"dan *f.is.*

**BOŞALDILMAQ** *məch.* Boş hala gətirilmək, içindəkilər götürülmək, yükdən, minikdən azad edilmək. *Maşının yükü bir neçə dəqiqəyə boşaldıldı. – Karvansaralar, hücrələr boşaldılmışdı.* M.S.Ordubadi. *Axşam evinin boşaldılacağı xəbəri ilə quduran Əminə .. Qədirin üstünə cummuşdu.* Ə.Əbülhəsən.

**BOŞALDILMIŞ** *f.sif.* Boş hala salınmış, içindəki şeylərdən azad edilmiş (b a x **boşaltmaq** 7-ci mənadan başqa). *Boşaldılmış qab. Boşaldılmış maşın. Boşaldılmış ip. Boşaldılmış vint.*

**BOŞALMA** "Boşalmaq"dan *f.is.*

**BOŞALMAQ** *f.* 1. Boş olmaq, boş qalmaq, boş hala gəlmək. *Ev boşaldı. Qablar boşaldı.*

2. Bərkliyini, sərtliyini, gərginliyini itirmək; yumşalmaq. *Atın quşqunu boşalıbdır. Dəri boşalıbdır.*

3. Ciddiyyətini itirmək, zəiflik göstərmək, iradəsizlik göstərmək. [Şəhrəbanı xanım:] *Hatəmxan ağa, özün bilmirsən ki, bir xamırağız kişidir. Əvvəldən yaxşı danışdı, sonra birdən boşaldı.* M.F.Axundzadə.

4. Gülləsi atılmaq, yaxud çıxarılmaq. *Tüfənglər boşaldı.*

**BOŞALMIŞ** *f.sif.* Boş hala gəlmiş. *Boşalmış kisə. Boşalmış qab. Boşalmış vinti bərkitmək. Boşalmış qayış. Boşalmış ev. Boşalmış yerə işçi götürmək. – Hüseyn Məhbusi Kərimxanın yanından çıxıb, bir qədər Tehranın boşalmış küçələrində dolaşdı.* M.İbrahimov.

**BOŞALTDIRILMA** "Boşaltdırılmaq"dan *f.is.*

**BOŞALTDIRILMAQ** *məch.* Boşaltmağa məcbur edilmək.

**BOŞALTDIRMA** "Boşaltdırmaq"dan *f.is.*

**BOŞALTDIRMAQ** *icb.* Boşaltmağa məcbur etmək, boşaldılmasına nail olmaq. *Evi boşaltdırmaq.*

**BOŞALTMA** "Boşaltmaq"dan *f.is.*

**BOŞALTMAQ** *f.* 1. Bir şeyin içindəkiləri çıxarıb boş hala salmaq. *Yeşikləri boşaltmaq. Ciblərini boşaltmaq. – Torbanı boşaldanda, içindən kağıza bükülmüş bir yumru şey çıxdı.* S.S.Axundov. // Yükdən azad etmək. *Vaqonu boşaltmaq. Avtomobili boşaltmaq. Arabanı boşaltmaq.*

2. *məc.* İçindəkini içmək, yemək. *Sofi İranpərəst badəni boşaldıb, stola yaxınlaşdı.* M.İbrahimov.

3. Təxliyə etmək; tərk edib başqa yerə köçmək, çıxmaq. *Şəhəri boşaltmaq. Evi boşaltmaq. Mənzili boşaltmaq.*

4. Bir qabdan başqa qaba tökmək. *Unu tabağa boşaltmaq. Suyu ləyənə boşaltmaq.*

5. Gərginliyini, tarımlığını azaltmaq, bir az açmaq, boş eləmək. *Atın quşqununu boşaltmaq. Çəkmələrimin bağını boşaltdım.*

6. Atmaq (odlu silahdan). [Oruc:] *Vəli, tüfəngin çaxmağını yuxarı qovza ki, hamımız birdən tüfəngləri boşaldaq.* M.F.Axundzadə. *Dayanmadan tüfəngimi boşaltdım; Dallarınca bir neçə güllə atdım.* A.Səhhət. *Bir anda bir daraq güllə boşaltdım.* S.Vurğun.

7. *məc.* Açıb söyləmək. *Sərdar Rəşidin dili açıldı, o, ürəyindəkiləri ortalığa boşaltmağa başladı.* M.S.Ordubadi. *Məstan bəyin ürəyi dolu idi. Boşaltmağa adam axtarırdı.* B.Talıblı. *Mədəd, sənin ürəyin dolu imiş, boşalt gəlsin!* Ə.Əbülhəsən.

**BOŞAMA** "Boşamaq"dan *f.is.*

**BOŞAMAQ** *f.* İzdivacını ləğv etmək, arvadından ayrılmaq, əlaqəsini kəsmək. *Arvadını boşamaq.*

**BOŞANDIRMA** "Boşandırmaq"dan *f.is.*

**BOŞANDIRMAQ** b a x **boşatmaq.**

**BOŞANMA** "Boşanmaq"dan *f.is.*

**BOŞANMAQ** *f.* Ərindən ayrılmaq.

**BOŞATDIRMA** "Boşatdırmaq"dan *f.is.*

**BOŞATDIRMAQ** *icb.* Boşanmağa məcbur etmək, boşanmasına nail olmaq.

**BOŞATMA** "Boşatmaq"dan *f.is.*

**BOŞATMAQ** *f.* Boşamasına səbəb olmaq, boşamağa məcbur etmək. [Xanpəri:] *Onun cadusunda mən bir hikmət görmüşəm ki, əgər istəsə, bu saat məni qocamdan boşadar.* M.F.Axundzadə.

**BOŞBEYİN** *sif.* Axmaq, başıboş, gic, səfeh.

**BOŞBEYİNLİK** *is.* Axmaqlıq, başıboşluq, giclik, səfehlik.

**BOŞ-BİKAR** *zərf* İşsiz, boş-boşuna, veyil. *Boş-bikar gəzmək. Boş-bikar qalmaq. –* [Firuz] *boş-bikar oturub qalır.* Ə.Məmmədxanlı. [Məsmə:] *Sənin nəyinə yaraşır gedib boş-bikar oturub çərəkə höccələyəsən?* Mir Cəlal.

**BOŞBOĞAZ** *sif.* Ağzına və ağlına gələni danışan, boşuna danışan, mənasız danışan; hərzəgu, naqqal, gəvəzə. *Boşboğaz adam. – Bizim bəzi boşboğaz yazıçılarımız da oxşayırlar haman təbiblərə ki, azarlının nəbzinə baxandan sonra, "xudahafiz" deyib, börklərini axtarırlar.* C.Məmmədquluzadə. // *İs. mənasında.* Sirr saxlamayan, ağzıboş. [Pyotr:] *Vera da atası kimi ciddidir, sadiqdir, çoxdanışan və boşboğaz deyil.* S.Rəhman.

**BOŞBOĞAZLIQ** *is.* Naqqallıq, boş-boş danışma, hərzəçilik; boşboğaz adamın xüsusiyyəti. *Boşboğazlıqla məşğul olma.* – [Sübhanverdizadə:] *Hə, o mühəndis iş adamına heç oxşamır, .. boşboğazlıq eləyib gəzir.* S.Rəhimov. // Cəfəngiyat, boş sözlər. [Əbülhəsən bəy:] *Mənim təbiət fəlsəfəsinə dair söhbətlərim tamamilə sadə və boşboğazlıqdan ibarət imiş.* M.S.Ordubadi.

**BOŞ-BOŞUNA** *zərf* 1. Mənasız, gərəksiz, faydasız, səmərəsiz, nəticəsiz, hədər, əbəs. *Boş-boşuna vaxt keçirmək. Boş-boşuna gəzmək. – Tərbiyəsiz uşaq kimi boş-boşuna hırıldama.* M.Ə.Sabir. *Bu vəfasız ömür, bu coşqun dərə; Gərək boş-boşuna axıb keçməsin.* M.Müşfiq.

2. İçində heç bir şey olmadığı halda. *Kimisi boş-boşuna tüfəngin çaxmağını taqqıldadır, kimisi torbasını doldurur, bəziləri də ayaqqabılarını düzəldirdi.* H.Nəzərli.

**BOŞBUYNUZLU** *sif. zool.* Buynuzunun içərisi boş olan. *Boşbuynuzlu heyvanlar.*

**BOŞBUYNUZLULAR** *is. zool.* Cütdırnaqlı məməli heyvanların boş buynuzu olan növləri.

**BOŞQAB** *is.* İçinə xörək və s. tökmək üçün çinidən, saxsıdan, metaldan və s.-dən qayrılmış qab; nimçə. *Dərin boşqab. Dayaz boşqab. Naxışlı boşqab.*

**BOŞLAMA** "Boşlamaq"dan *f.is.*

**BOŞLAMAQ** *f.* 1. Buraxmaq, vaz keçmək, əl çəkmək. [Kərim:] *Yəni bunu deməkdə qərəzin nədir? İstəyirsən ki, mən səni boşlayım, qaçasan?* M.F.Axundzadə. *Boşla, ay molla dayı, sən də bizi çəkmə zora.* M.Ə.Sabir. [Səlim:] *Ürəyimə yatan işdir, boşlaya bilmərəm.* Mir Cəlal.

2. Bir işlə daha məşğul olmamaq, tərk etmək. *Papirosu çoxdan boşlamışam.*

**BOŞLANMAQ** b a x **boşalmaq** 1-ci mənada. *Qoşun qaçdı, boşlandı meydani-cəng; Bütün getdi yəğmayə topü tüfəng.* M.Ə.Sabir.

**BOŞLUQ** *is.* 1. Boş yer, boş sahə. *Bura başdan-başa boşluqdur. – Sahil boyu seyrək meşəlik və əngin bir boşluq idi.* S.Rəhimov. // Məsamə, xırda deşik, oyuq. *Külli miqdarda neft və qaz, yalnız böyük həcmdə boşluqları, yəni müəyyən, məsamələri olan süxurlarda yerləşir.* Quliyev. // *məc.* Fəza. *Uçurur fikrimi boşluqlara, bax; Göyü xəncər kimi dümdüz yararaq.* S.Vurğun.

2. *anat.* Bədəndə: ayrı-ayrı üzvlərin yerləşdiyi yer. *Ağız boşluğu. Qarın boşluğu.*

3. Boş şeyin halı; yumşaqlıq, kövrəklik (*bərklik* ziddi). *Torpağın boşluğu. Qəndin boşluğu.*

4. Sıyıqlıq, duruhallıq. *Xəmirin boşluğu.*

5. *məc. dan.* Ciddiyyətsizlik, laqeydlik, zabitəsizlik, zəiflik. *Boşluq göstərmək.* – [Gülməmməd:] *Bəy, özün də boşluq eyləyibsən.* Ə.Haqverdiyev.

**BOT** [*fr.*] Boğazlı qaloş. *Uşaq botu. Qadın botu.*

**BOTÁNİK** [*yun.*] Botanika mütəxəssisi, nəbatatçı. *Aşkara çıxarılmış dərman bitkiləri botaniklər .. tərəfindən öyrənilərək, tibb praktikasına daxil edilməkdədir.* Əliyev.

**BOTÁNİKA** [*yun.*] Bitkilər haqqında elm; nəbatat elmi.

**BOTİNKÁ** [*fr.*] Alçaq boğazlı, ya boğazsız kişi, qadın və uşaq ayaqqabısı. [Teymurun] *əynində boz rəngli nazik parçadan şalvar-köynək, ayağında isə qalın padoşlu soldat botinkası vardı.* M.Hüseyn.

**BOY**[1] *is.* 1. Bədənin uzunluğu; qədd, qamət. *Boyu uca adam. Boyu qısa. Sənin boyda. Bir boyda. – Bir balaca boyu var, ev dolusu toyu var.* (Tapmaca). // Bədən quruluşu, bədəndə tənasüb. *O qadının heç boyu yoxdur.*

2. Ümumiyyətlə, uzunluq. *Gəbənin boyu. Otağın boyu altı metrdir.*

3. Yüksəklik, hündürlük. *Ağacın boyu.*

4. Adətən **boyda** şəklində – böyüklükdə. *Bu boyda balıq görməmişəm. – Bundan təkcə bir adama zərər dəymir, bu boyda məmləkətin işi axsayır.* M.Hüseyn. [Mədəd:] *..Bu boyda kənddə bizdən savay adam tapmadınız, qəzetə vurasınız?* İ.Əfəndiyev. // Adətən

**boyu, boyunca, boyunda, boyu ilə** şəklində zərf mənasında işlənərək, bir şeyin uzununa davamını, uzunluğunu, böyüklüyünü, yaxud müddətcə davamını bildirir. *Sahil boyunca ağaclar əkilmişdir. – Xəzər boyu yol uzanır dağ ətəyilə.* R.Rza. *Nur saçır Mingəçevir; Gülür Kür boyu dağ-daş.* Ə.Cəmil. *Ancaq bunlar tarix boyu bizi qazma daxmadan çıxara bilməmişdi.* Mir Cəlal. *Bu torpaqlar əsrlər boyu xalqımızın alın təri və qanı ilə suvarılmışdır.* Ə.Məmmədxanlı.

◊ **Boy atmaq** – 1) uzanmaq, böyümək, inkişaf etmək. *Uşaq boy atır. Ağac boy atır. Hər bir bitki cücərib boy atmaq və məhsul vermək üçün torpaqdan qida almalıdır. Tarlalarda milyonlarla pambıq cücərtiləri yavaş-yavaş boy atır. – Siz sərv kimi sərkeş olub böylə boy atdız.* M.Ə.Sabir. *Burda, bu ağacda hər oğlan, hər qız; Bir zaman boy atıb bir nər olacaq.* S.Vurğun; 2) *məc.* İnkişaf etmək, tərəqqi etmək, irəliləmək, təcrübə qazanmaq, bərkimək, bişmək. *Biz bu dostluq yollarında böyümüşük, boy atmışıq.* S.Rüstəm. *Döyüşlərdə zəfər çaldın, boy atdın.* R.Rza. *Mən sevirəm üzərində boy atdığım torpağı.* Ə.Cəmil. *Biz gözümüzü həyata burada açmış, onun göyləri, ulduzları altında boy atmışıq.* Ə.Məmmədxanlı. **Boy çəkmək** – b a x **boy atmaq** 1-ci mənada. **Boy durmaq** – ayaq üstə düz durmaq. **Boy görmə** – köhnə məişətdə: hədiyyə apararaq, gəlinlə ilk dəfə görüşmə. **Boy vermək** – 1) b a x **boy atmaq** 1-ci mənada; 2) boyca, yaxud uzunluqca bərabər olmaq; 3) adam boyundan yuxarı olmamaq (suyun səviyyəsi). **Boya-başa yetirmək (çatdırmaq, çıxarmaq)** – yetişdirmək, tərbiyələndirib böyütmək. [Hacı Murad:] *Budur, on iki ildir ki, mən ata-anasız yetimi .. boya-başa çatdırmışam.* S.S.Axundov. [Qızın anası:] *Hey, hey, zəhmət çəkmişəm, qız böyüdüb boya-başa çatdırmışam. Uşağımdan bezar ki deyiləm.* H.Sarabski. *Cavanları tərbiyələndirmək, onları gələcək üçün, ölkə üçün yetişdirib boya-başa çatdırmaq əlavə diqqət və qayğı tələb edirdi.* M.Hüseyn. **Boya-başa yetişmək (yetmək, çatmaq, çıxmaq)** – yetişmək, böyümək, tərbiyələnib ortaya çıxmaq. *Boya-başa çatan cavan .. faşistlərin əlində əsir olub qalacaqdımı?* Ə.Əbülhəsən. **Boy-boya vermək** – ayaq üstə dayanmaq (bir neçə adam haqqında). [Ballı:] *Niyə belə boy-boya veribsiz?* İ.Əfəndiyev. **Boyu dolu** – hamilə. *Səbanın qarnı gözümə bir cür dəydi, – deyə Qaraxan .. arvadından soruşdu. – Boyu doludur, dayna, – deyə arvadı cavab verdi.* S.Rəhimov.

**BOY**[2] *is. folk.* Dastanlarda müəyyən hadisəyə həsr edilmiş fəsil, hissə. *“Dədə Qorqud” boyları. Dəli Domrul boyu.*

**BOY**[3] b a x **boymadərən.**

**BOY**[4] *nida.* Qorxu, səksənmə, təəccüb bildirir. *Boy, ilana bax, gör nə uzundur!*

**BOYA** *is.* 1. Bir şeyə müəyyən rəng vermək, bir şeyi boyamaq, yaxud rəsm çəkmək üçün işlədilən rəng maddəsi. *Qırmızı boya. Yağlı boya. Sulu boya. – Gülnaz gülərək, yerindən cəld qalxdı, iplərin boyalarına bulaşmış barmaqları ilə artırmaya atılmış dolulardan götürdü..* Çəmənzəminli.

2. Ton, rəng, xüsusiyyət (rəsmdə, təbiətdə və s.). *Bu rəssamın əsərləri öz boyaları ilə nəzəri cəlb edir. Klubun şəfəq saçan boyaları.* // Məc. mənada. *Getdikcə ictimai həyat öz boyasını dəyişirdi.* C.Cabbarlı. *Təbiətdəki hər mülayim cizgi, hər tanış boya dəyişilmiş, yabançılaşmışdı.* Ə.Məmmədxanlı.

3. *məc.* Təsviri, nitqi, ahəngi, üslubu canlandıran, gözəlləşdirən ifadə vasitəsi mənasında (çox vaxt cəm şəklində). *Bizim məsələmizi nə hicran kəlmələrinin cürbəcür boyalarda verilməsi, nə də iztirabın dəhşətli qiyafədə təsəvvür edilməsi həll etmir.* M.S.Ordubadi. *Vaqiə aristokrat həyatından götürülmüş bir əyyaşın əhvali-ruhiyyəsini kəskin boyalarla təsvir edirdi.* A.Şaiq. [Nərimanovun] .. *“Pir” povesti din, xurafat üstündə qurulmuş Şərq cəhalətini dərindən və son dərəcə realist boyalarla ifşa edir.* M.İbrahimov.

**BOYABOY** *zərf* 1. Bir şeyin boyunda, uzunluğunda; boyca uyğun. *Həmin uzun evin ortası üçün boyaboy miz düzəlmiş və yanlarına isə yerə bərkidilmiş skamyalar qoyulmuşdur.* S.Rəhimov.

2. Başdan-başa, uzununa. *Sahil pəncərəmizdən boyaboy görünür.*

**BOYADILMA** “Boyadılmaq”dan *f.is.*

**BOYADILMAQ** *məch.* Boyaq çəkdirilmək, rəngləndirilmək, rəng çəkdirilmək.

**BOYAXANA** *is.* [*fars.*] Parça, ip və s. boyamaqla məşğul olan karxana, müəssisə.

**BOYAKAR** *is.* Boya ilə şəkil çəkən rəssam. *Nuxa Xan sarayının divar təsvirləri müxtəlif zamanlarda yaşayıb-yaratmış müxtəlif boyakar rəssamların əsərləridir.* Salamzadə.

**BOYAKARLIQ** *is.* Boya ilə şəkil çəkmə işi, sənəti.

**BOYAQ** *is.* 1. B a x **boya** 1-ci mənada.

2. *bot.* Kökündən boyayıcı maddə hasil edilən bitki.

**BOYAQÇI** *is.* Boyaqçılıqla məşğul olan adam.

**BOYAQÇILIQ** *is.* İp, parça və s. boyama işi, sənəti. *Boyaqçılıqla məşğul olmaq.*

**BOYAQXANA** b a x **boyaxana.** *Uşağı boyaqxanaya gətirib, boyaqxanaçıya onun üz-gözünü boyatdırardılar.* H.Sarabski.

**BOYAQLI** *sif.* Boyanmış, rənglənmiş. *Boyaqlı bez.*

**BOYAQOTU** *is. bot.* Başlıca olaraq dağlıq yerlərdə bitən çoxillik ot bitki.

**BOYAQSIZ** *sif.* Boyanmamış, rənglənməmiş. *Boyaqsız parça.*

**BOYALAMA** "Boyalamaq"dan *f.is.*

**BOYALAMAQ** b a x **boyamaq.**

**BOYALI** *sif.* 1. Boyanmış, rənglənmiş, rəngli; boya sürtülmüş. *Boyalı kağız.* – [Kişinin] *qara boyalı bığlarının ətrafındakı dərin cizgilər gah bu füsunkar mənzərə qarşısında xəfiflənir, gah da dərinləşərək ağır qayğılar ifadə edirdi.* Çəmənzəminli. *Dükan-bazar boyalı yumurtalar, rəngarəng parçalar, əli-ayağı xınalı adamlarla dolmuşdu.* M.İbrahimov. // Üzünə boya (kirşan və s.) sürtmüş, üzünü boyamış. *Boyalı qadın.*

2. *məc.* Zahirən aldadıcı, süni. [Qətibə:] *Ancaq mən sevgilərin bu qədər aldadıcı və boyalı olduğunu bilmirdim.* M.S.Ordubadi.

**BOYALIQ** *is.* Boyaq bitən yer (b a x **boyaq** 2-ci mənada).

**BOYALILIQ** *is.* Boyalı şeyin halı.

**BOYAMA** "Boyamaq"dan *f.is.*

**BOYAMAQ** *f.* 1. Bir şeyi boyağa salaraq və ya bir şeyə boya sürtərək ona müəyyən bir rəng vermək; rəngləmək. *Bezi boyamaq. Qapıları boyamaq. Saçlarını boyamaq.* // Məc. mənada. *Meşənin üzərində bir yaylaq qızartısı artır, getdikcə meşəni boyayırdı.* S.Rəhimov.

2. *məc.* Batırmaq, bulamaq, qərq etmək. *General Nakaşidzenin başı parçalanmışdı. Ağzını tez-tez açıb yumur, qanlara boyadığı Bakıya vida edirdi.* M.S.Ordubadi.

3. Kirləndirmək, ləkələndirmək, batırmaq. *Uşaq əllərini mürəkkəbə boyadı.*

4. Bir şeyin çoxluğunu, bolluğunu bildirir. [Heydər bəy:] *Hanı qızılbaş və osmanlı döyüşü ki, tamam Qarabağı qızıl-gümüşə boyadı.* M.F.Axundzadə.

**BOYANA** *is. bot.* Cirə; təbabətdə və kulinariyada istifadə olunan ətirli bitki.

**BOYANALI** *sif.* Boyana vurulmuş. *Hər adama bir məcməyi verildi və hər məcməyidə bir boşqab boyanalı plov, üstündə quzu soyutması, yanında da sarımsaqlı qatıq və bağır-beyin vardı.* Çəmənzəminli.

**BOYANMA** "Boyanmaq"dan *f.is.*

**BOYANMAQ** *f.* 1. Rənglənmək, boya ilə örtülmək, boya qəbul etmək. *Parça yaxşı boyanır.* // Məc. mənada. *Hər yer batan günəş şöləsi ilə boyanmışdı. – Yer üzü qırmızımtraq bir rəngə boyanırdı.* Ə.Əbülhəsən.

2. Batmaq, bulanmaq. *Al qana boyanmaq. – Şahin-şunqar sürbənizi dağıdar; Boyanarsız qızıl qana, durnalar!* M.V.Vidadi. // Özünü, üst-başını boyamaq, kirləndirmək, ləkələndirmək, batırmaq. *Uşağın üst-başı mürəkkəbə boyanmışdır.*

3. *qayıd.* Üz-gözünə boya sürtmək.

4. *məc.* Alışmaq, mübtəla olmaq. *Biz atəşi-hicran ilə duzəxlərə yandıq; Sevdaya boyandıq.* S.Ə.Şirvani.

**BOYANMIŞ** *f.sif.* 1. Boyağa salınmış, yaxud boya çəkilmiş; rənglənmiş. *Boyanmış bez. Boyanmış parça.*

2. Üz-gözünə boya sürtmüş, sifəti, qaşları boyalı.

**BOYÁR** [*rus.* боярин sözündən] *tar.* 1. Moskva dövlətində yüksək rütbə və bu cür rütbəsi olan şəxs.

2. Qədim Rusiyada və Moskva dövlətində hakim sinfin yuxarı təbəqəsinin nümayəndəsi olan iri mülkədar.

**BOYARLIQ** *is. tar.* 1. Boyar rütbəsi.

2. *top.* Boyarlar.

**BOYASIZ** *sif.* 1. Boyası olmayan, rəngsiz, rəng çəkilməmiş.

2. *məc.* Təmiz, saf.

**BOYATDIRMA** "Boyatdırmaq"dan *f.is.*

**BOYATDIRMAQ** *icb.* Boya (rəng) çəkdirmək, rənglətmək.

**BOYATMA** "Boyatmaq"dan *f.is.*

**BOYATMAQ** *icb.* Boyağa vermək, rəng (boyaq) çəkdirmək, rənglətmək. *Bezi boyatmaq.*

**BOYAYICI** *sif.* Boyayan, rəngləyən; tərkibində boya maddəsi olan. *Boyayıcı maddələr.*

**BOY-BUXUN** *is.* Qədd-qamət, boy, bədən quruluşu. *Onun boy-buxunu yaxşıdır. – Səməd dayı otağın yuxarı başında bığlarını burmuş, oturub Nadirin boy-buxununa baxırdı.* B.Talıblı. *O boy-buxun gözlərimə dəyəndə; Xəstə ruhum təzələnir, ay Pəri!* R.Rza.

**BOY-BUXUNLU** *sif.* Yaxşı boyu, qaməti, gözəl bədən quruluşu olan; qədd-qamətli, təndürüst. *Xanın bütün diqqəti yuxarı başda əyləşmiş qartal burunlu, şahbaz baxışlı, çevik hərəkətli və boy-buxunlu Ömər xanda idi.* Çəmənzəminli. *Bir enlikürək, boy-buxunlu oğlan iclası açdı.* Mir Cəlal.

**BOY-BUXUNLULUQ** *is.* Boy-buxunlu olma; qamətlilik, təndürüstlük.

**BOYDAŞ** *sif.* Boyları bir olan, bir boyda olanlar; tay-tuş. *Baxdıqca onlara, boydaşlarına; ..Oynadır qəlbimi sevimli bu hal.* A.Şaiq.

**BOYGƏRDƏNƏ** *is. məh.* Yeməli bir bitki.

**BOYHABOY** *zərf* Bir boyda, yan-yana, sıra ilə. *Çayın hər iki sahilində boyhaboy ağaclar yüksələrək, çayı bir xiyaban kimi aralığa almışdı.* Ə.Sadıq.

**BOYKÓT** *is.* [*ing.*] Bir şəxs, təşkilat, dövlət və s. ilə tamamilə, yaxud qismən əlaqəni kəsməkdən, ona saymazlıq göstərməkdən ibarət siyasi və iqtisadi mübarizə üsulu. *Boykot elan etmək* (etiraz əlaməti olaraq birisi ilə əlaqəni kəsmək). ☐ **Boykot etmək** *məc.* – etiraz əlaməti olaraq birisi ilə əlaqəni kəsmək. *..Mahalın .. camaatı bəyin bu hərəkətini öz əleyhinə açıq-açığına bir ədavət sayıb, söz bir yerdə qoydular ki, onu boykot eləsinlər.* Ə.Haqverdiyev. [Mir Mahmud:] *Məni boykot eləməsinlər deyə, familiyamı dəyişib, Kazımovski qoymuşam.* S.Rəhman.

**BOYLAMA** *sif. məh.* Boy bərabərdə olan.

**BOYLAMAQ** *f.* 1. Suyun dərinliyini bilmək üçün onu ölçüb, yaxud içinə girib yoxlamaq.

2. B a x **boylanmaq** 1-ci mənada. *Camaatın yarısı çıxmışdı kəndin kənarına və təpələrə dırmaşıb boylayırdılar ki, görsünlər gəlirmi naçalnik?* C.Məmmədquluzadə.

**BOYLANMA** "Boylanmaq"dan *f.is.*

**BOYLANMAQ** *f.* 1. Başını, boynunu uzadıb baxmaq, başını çıxarıb baxmaq. *Pəncərədən boylanıb baxmaq. – Rza Qəhrəmani həyəcanla işi buraxıb, deponun qapısına çıxdı və vağzala tərəf boylandı.* M.İbrahimov. *Pəncərədən boylananları salamlayan musiqi və alqış səsləri bir-birinə qarışdı.* Mir Cəlal. *Ayaz .. qızın çiyni üzərindən küçəyə boylandı.* Ə.Məmmədxanlı. // Ümumiyyətlə, müşahidə aparmaq, qabağa-dala, sağa-sola baxmaq. *Laçın dörd yanına boylandı.* M.Hüseyn. *Nəriman ha boylanır, heç yerdə həyat izi görməyirdi.* Mir Cəlal. // Məc. mənada. *Boylanır qabağımda böyük bir əməl; Ucalır başım.* M.Müşfiq. *Dumanlar içində .. əli göz üstə; Qoca Şərq boylanır dalınca sənin.* S.Vurğun.

2. *məc.* Görünmək, özünü göstərmək, baxmaq. *Günəş uca dağların arxasından yenicə boylanmışdır. – Dan ulduzu Nargin adasının dalından boylanır, Susannanın pəncərəsinə baxırdı.* M.S.Ordubadi. *Sanki buludlar arasından boylanmış Ay, işıqlarını otağa yaydı və çəkildi.* M.İbrahimov. *Səhər üfüqlərindən gün boylanırdı.* M.Seyidzadə.

3. *məc.* Yüksəlmək, qalxmaq, ucalmaq, görünmək (hündür şey haqqında). *Yaşıllıqlar arasından boylanan evlərin qırmızı damları görünür. – Yüksəklərə, mavi göylərə doğru boylanan bacalar Qara şəhərin zirzəmilərində vərəmləyən fəhlələrin dastanını oxuyurdu.* M.S.Ordubadi.

**boylana-boylana** *zərf* Ətrafına baxa-baxa, baxına-baxına. *Milis nəfəri arxadan boylana-boylana gəlirdi.* S.Rəhimov.

**BOYLU**[1] *sif.* Ucaboy, boylu-buxunlu, qədd-qamətli. *Boylu oğlan. –* [Kompozitor] *boylu .. bir adamla qarşılaşdı.* İ.Əfəndiyev. // Uca. *Boylu çinar budaq atmış, qol atmış.* R.Rza. *Hərdən boylu qovaqların xışıldayır yarpağı.* Ə.Cəmil.

**BOYLU²** *sif. dan.* İkicanlı, hamilə. *Boylu qadın.*

**BOYLU-BUXUNLU** bax **boy-buxunlu**. *Boylu-buxunlu oğlan. – ..Solovyov yaşı təzəcə iyirmi beşə girən, boylu-buxunlu, yaraşıqlı bir kişi idi.* Ə.Əbülhəsən. *Biz çayxanadan çıxanda əyninə ipək pencək geymiş boylu-buxunlu, qarabığlı bir kişi qollarını ata-ata içəri girdi.* "Kirpi".

**BOYLUQ** *is.* Boy (boymadərən) çiçəyi bitən yer.

**BOYLULUQ** *is. dan.* İkicanlılıq, hamiləlik.

**BOYMADƏRƏN** *is. bot.* Koma halında sarı çiçəyi və xoş qoxusu olan çoxillik bitki (xalq təbabətində işlənir). [Boymadərənin] *düz duran gövdəsinin üzərində sıra ilə düzülmüş yarpaqları və gövdəsinin təpəsində səbət şəkilli, ağ rəngli çiçəkləri vardır.* Əliyev. ☐ **Boymadərən arağı** – həmin bitkidən çəkilmiş cövhər, dərman.

**BOYMADƏRƏNLİK** *is.* Boymadərən bitən yer.

**BOYNUBURUQ** *sif. dan.* Məzlum, məhzun, yazıq, fağır; yetim. // *zərf* Yazıq-yazıq, fağır-fağır. *Gözü yolda boynuburuq qalınca; Ölüm aşiqlərə xoş səadətdi.* Q.Zakir.

**BOYNUBÜKÜK** bax **boynuburuq.**

**BOYNUDƏRİLİ** bax **boynuxəzli.** *Onun hər şeyi təzələnmiş, bircə boynudərili paltosu əski halında qalmışdı.* Qantəmir.

**BOYNUXƏZLİ** *sif.* Yaxalığı xəzdən (dəridən) olan. *Boynuxəzli palto.*

**BOYNUYOĞUN** *sif.* və *is.* 1. Boynu normal haldan yoğun olan.

2. *məc. dan.* Zəhmətsiz yaşayan, müftəxor, tüfeyli, istismarçı. *Məşədi Əbdülbağı razı olmamışdı ki, dörd yüz on manat verilsin boynuyoğun molla Qivama..* C.Məmmədquluzadə. *Bu yeddi günün içində plov qurşağa çıxdı; şəhərin hamı mollaları, boynuyoğunları, arvadları, uşaqları hər gün ehsanda cəm olurdular.* Ə.Haqverdiyev.

**BOYÖLÇƏN** *is. xüs.* Boy ölçmək üçün cihaz (gimnastika zallarında, sanatoriyalarda, xəstəxanalarda və s.-də).

**BOYSUZ** *sif.* Boyu kiçik, qısa. *Boysuz adam. Boysuz qız. Boysuz otaq.*

**BOYSUZLUQ** *is.* Qısalıq, gödəklik.

**BOYUN** *is.* 1. Başın bədənlə birləşən hissəsi. *Yoğun boyun. Əyri boyun. Uzun boyun. Boynundan yapışmaq.*

2. Paltarın, boğazı dövrələyən hissəsi. *Paltonun boynu. Dik boyun. Köynəyin boynu dardır.*

3. Arabaya və kotana qoşulan cüt heyvan (öküz, ya kəl). *Tarverdi hərəsi dörd boyun*, [yəni] *səkkiz öküzdən ibarət iki xış əlavə düzəldib, kövşənə saldı.* S.Rəhimov. *Qara kişi bir boyun öküz alıb.* Ə.Əbülhəsən.

4. Bir şeyin boyuna oxşayan hissəsi. *Elektrik çarxının boynuna dolaşan qayışın qəzəblə hərəkəti, mədən qarovullarının fit səsləri .. Jenyanı düşündürürdü.* M.S.Ordubadi.

5. Dağın, qayanın və s.-nin təpəsi ilə döşü arasındakı hissə. *Ortadakı təpənin boynunda çoban dayanmışdı.* S.Rəhimov.

6. Yerlik halında: **boynunda, boynumda, boynumuzda** və s. – üzərində, üzərimdə, üzərimizdə; öhdəsində, öhdəmdə, öhdəmizdə və s. *Can qəmin çəkmiş idi, var idi boynumda həqqi.* Füzuli. *Kimdir mənim kimi ellər dəlisi? Hər kimsənin öz boynunda karı var.* Q.Zakir. [Fərhad:] *Əmimin mənim boynumda çox haqqı var.* Ə.Haqverdiyev. // Çıxışlıq halında: **boynundan, boynumdan, boynumuzdan** və s. – üzərindən, üzərimdən, üzərimizdən və s. [Məhərrəm bəy:] *Dərhal durub gəldim ki, o borcu* [İmrana] *verib atamın boynundan saqit edəm.* S.S.Axundov. // Yönlük halında: **boynuna, boynuma, boynumuza** və s. – üzərinə, üzərimə, üzərimizə və s. [Alı:] *Hörgü işləri bizim boynumuza.* İ.Əfəndiyev.

◊ **Boynu gəlmək** – boyunduruqdan boyun əti şişmək (heyvanın). **Boynu(n) sınsın!** – qarğış, nifrin yerində işlənir. [Cənnətəli:] *Baxırsanmı? Ha sizin boynunuz sınsın!* N.Vəzirov. **Boynuna almaq** – 1) bir işi görmüş olduğunu etiraf etmək, açıb söyləmək. *Müttəhim günahlarını boynuna aldı. Öz səhvini namusla boynuna almaq.* – [Əsədin] *fikrincə, Mahmud əmi xortdanı görməsə və ya görüb də boynuna almasa, daha bundan sonra bir kəs onun sözünə inanmayacaq..* B.Talıblı; 2) öhdəsinə götürmək, üzərinə götürmək. *Niftalı bəy də boynuna aldı ki, Həcəri tutaram.* "Qaçaq Nəbi". **Boynuna**

**atılmaq** – qucaqlamaq. *Pəricahan xanım .. qaçaraq Əmir Aslan ağanın boynuna atılır.* S.S.Axundov. **Boynuna atmaq** – b a x **boynuna yıxmaq**. [Kapitan:] *Bu* [şübhə] *bizə haqq vermir ki, hər şeyi onun boynuna ataq.* Ə.Əbülhəsən. **Boynuna bağlamaq** – b a x **boynuna qoymaq** 3-cü mənada. *Buna əlavə olaraq bizim boynumuza elə bir yazı da bağladılar ki, onun sayəsində ümumə müyəssər olan savadı əldə etmək bizim üçün işlərin ən çətini olmuşdur.* M.F.Axundzadə**.** **Boynuna çəkmək** – öhdəsinə götürmək, üzərinə götürmək, razı olmaq. *Usta Zeynal gəldi və boynuna çəkdi, günü iki manata Muqdusi Akopun səqfini təmir etsin.* C.Məmmədquluzadə. **Boynuna düşmək** – 1) üzərinə düşmək, öhdəsinə düşmək. *Beləliklə, payız əkininin qalmış hissəsini başa vurmaq, tör-töküntüləri qurtarmaq Mürşüdoğlunun boynuna düşmüşdü.* S.Rəhimov; 2) acığa düşmək, tərslik etmək, inad etmək, tərsliyə başlamaq. *Oğlan evinin də boynuna düşərdi, qızın talağını verməzdi, iş ölüb-öldürməyə çıxardı.* H.Sarabski. **Boynuna götürmək** – b a x **boynuna çəkmək**. *Bir dəfə boynuma götürmüşdüm ki, mən bunu* [tələbəni] *ictimaiyyatdan hazırlayım.* Qantəmir. *Mən işi öz boynuma götürməliyəm.* S.Rəhimov. **Boynuna qoymaq** – 1) iqrar etdirmək, etiraf etdirmək; 2) məcbur etmək, razı etmək, qəbul etdirmək. [Əmiri-topxanə:] *..Onu dəxi razı edin, boynuna qoyun.* M.F.Axundzadə. [Koxa:] *Mən özüm .. onların boynuna qoyaram ki, daha birdəfəlik oğurluğu tərgitsinlər.* S.Rəhimov; 3) üzərinə yükləmək, zorla qəbul etdirmək. **Boynuna mindirmək** – b a x **başına mindirmək** (**“baş”** sözündə). **Boynuna minmək** – birinin üzərində tam hakim olmaq, ixtiyarını əlindən almaq. **Boynuna minnət qoymaq** – b a x **minnət qoymaq** (**“minnət”** sözündə). **Boynuna sarılmaq** – b a x **boynuna atılmaq.** *Xala qapını açdı, məni görcək boynuma sarıldı.* S.S.Axundov. [Kərim baba:] *Qızımın boynuna necə sarılmışam, .. üzündən-gözündən necə öpürəm.* A.Şaiq. *Yarım saatdan bəri qapıda gözləyən Yeməncik nəşəli bir çığırıq ilə atasını qarşılayıb boynuna sarılır.* H.Nəzərli. **Boynuna təklif gəlmək** – üzərinə düşmək, üzərinə vəzifə düşmək. **Boynuna yıxmaq** – üzərinə atmaq, isnad etmək (təqsiri, günahı). **Boynuna yükləmək** – 1) öhdəsinə qoymaq, üzərinə qoymaq; 2) qəbul etdirmək (işi, vəzifəni). **Boynunda qalmaq** – öhdəsində qalmaq, borclu olmaq. **Boynunda olmaq** – 1) öhdəsində olmaq, üzərində olmaq, görməli olmaq. *Bu iş sənin boynunda olsaydı, çaşıb qalardın*; 2) hamilə olmaq. **Boynundan atmaq** – rədd etmək, üzərindən atmaq, öhdəsinə götürməmək. **Boynunu burmaq** – fağır-fağır durmaq. *Əbiş qollarını açaraq – Əsirgə, Kosa, balam yazıqdır, – deyib boynunu burdu.* S.Rəhimov. **Boynunu bükmək** – məhzun-məhzun, yazıq-yazıq, fağır-fağır, məzlum-məzlum oturmaq. [Tubu:] *Mən gedib günortayacan boynumu büküb, ağanın qapısında işimdən avara ola bilmərəm..* Ə.Haqverdiyev. *Hamısı boyunlarını bükərək, gözlərini aşağıdan yuxarı üzünə dikib baxırdı.* A.Şaiq. **Boynunu vurmaq** – başını kəsməklə edam etmək; // cəza olaraq öldürmək. *..Vur boynumu, gəl, var isə günahım; Sevdiyim, bu qədər əzab istəməz.* Q.Zakir. **Boynunun ardını görəndə** – heç vaxt, qətiyyən. **Boyun əti olmaq** – asılı olmaq. **Boyun əymək** – 1) tabe olmaq, itaət etmək. *Sahibkarlar tətil komitəsinin qarşısında boyun əyməkdən başqa bir çarə tapmırdılar.* M.S.Ordubadi. [Ramazan:] *Gedin, həmişəki kimi öz torpağınızı əkin, biçin və heç kəsə də boyun əyməyin.* B.Talıblı; 2) yalvarmaq, minnət etmək, alçalmaq. **Boyun qaçırmaq** – imtina etmək, qəbul etməmək, boynundan atmaq. [Hacı Qurban:] *Sənin heç yerdə sözün yerə düşməyibdir, indi nə üçün boyun qaçırırsan?* N.Vəzirov. *Fəhlələr öz təşkilatlarının intizamını gözləməkdən heç boyun qaçırmazlar.* M.S.Ordubadi. **Boyun qoymaq** – razı olmaq, öhdəsinə götürmək, üzərinə almaq. *Kənddən gələn yoxsullar ucuz qiymətə işləməyə boyun qoyduqlarından, zavod işçiləri sahibkardan heç bir tələb edə bilmədilər.* H.Nəzərli. **Boyun olmaq** – söz vermək, vəd etmək. *Bəyin yaxın adamlarından biri* [camadar və dəlləyə] *ya orada pul verərdi və ya da xələt boyun olardı.* H.Sarabski. [Firidun:] *Kasıb bir tələbə sizin*

*kimi xanıma nə boyun ola bilər?* M.İbrahimov; 2) boynuna almaq, düzünü demək. *Kəndlilər Nəbini gizlətdilər. Nəçənnik nə qədər qınadısa, boyun olmadılar.* "Qaçaq Nəbi". **Boyun tutmaq** – razı olmaq, qəbul etmək. **Boyun vermək** – razı olmaq, razılıq vermək, öhdəsinə götürmək. **Boyun-boyuna durmaq (vermək)** – məzlum-məzlum, yazıq-yazıq durmaq (bir neçə adam haqqında).

**BOYUNBAĞI** *is.* 1. Zinət üçün qadınların boyunlarından asdıqları muncuq və s. düzümü. [Yusif şah] *..qızlarının hər birinə bir gül .. və bir üzük və bir boyunbağı və bir dəst libas .. ayırdı.* M.F.Axundzadə. *Qadının yanında yaxşı tanıdığım bir həkim, boynunda isə iri mirvarilərdən diqqəti cəlb edən bir boyunbağı vardı.* Ə.Məmmədxanlı.

2. *dan.* Qalstuk. [Musanın nəvəsi] *səhər durdu, üzünü qırxdı, paltarını geyindi, ağ köynəyinin üstündən qara ipək boyunbağısını bağladı.* Qantəmir.

**BOYUNCUQ** *is.* Balaca boyun, zərif boyun, nazik boyun.

**BOYUNDURUQ** *is.* 1. İş heyvanlarını arabaya və s.-yə qoşmaq üçün onların boynuna keçirilən ağac çərçivə şəklində qoşqu cihazı. *Boyunduruqdan qaçan öküzü kəsərlər.* (Ata. sözü). *Salman kişi də arabanın boyunduruğuna oturdu.* A.Şaiq.

2. *məc.* Zülm, əsarət, məhkumluq mənasında. *Qaçmaq bacarmayanlar hamısı orada-burada boyunduruq altında qırılırlar.* Ə.Haqverdiyev. *Qəhrəmanlar yetişdirməyən bir xalq heç bir vaxt boynunu əcnəbi boyunduruğunun altından çıxara bilməz.* M.S.Ordubadi.

**BOYUNDURUQLAMA** "Boyunduruqlamaq"dan *f.is.*

**BOYUNDURUQLAMAQ** *f.* 1. Qoşqu heyvanlarının boynuna boyunduruq keçirmək. *Kəlləri boyunduruqlamaq. Öküzləri boyunduruqlamaq.*

2. *məc.* İtaət altına almaq, əsarət altına almaq, cilovlamaq, əsir etmək, məhkum etmək.

**BOYUNDURUQLANMA** "Boyunduruqlanmaq"dan *f.is.*

**BOYUNDURUQLANMAQ** *məch.* Boynuna boyunduruq keçirilmək.

**BOYUNDURUQLATMA** "Boyunduruqlatmaq"dan *f.is.*

**BOYUNDURUQLATMAQ** "Boyunduruqlamaq"dan *icb. Kəlləri boyunduruqlatmaq.*

**BOYUNDURUQLU** *sif.* 1. Boynunda boyunduruq olan, qoşulmuş. *Boyunduruqlu kəlləri kənarda qoyan adamlar tündməzac qocaya baxıb gülüşdü.* S.Rəhimov.

2. *məc.* Əsir, məhkum, ixtiyarsız; boyunduruq altında olan.

**BOYUNLUQ** *is.* Boyuna sarılan sarğı, boyun sarğısı; sarğı.

**BOYUNLUQLU** *sif.* Boynuna sarğı sarımış, boynunda sarğı olan.

**BOYUNSUZ** *sif.* Boynu çox qısa olan. [Casus] *bayquş kimi boyunsuz, bədəninə görə yekə, lakin mütəhərrik başını əcaib və iyrənc bir surətdə hərləyib, düz arxasına, indicə girdiyi qapıya baxdı.* M.Rzaquluzadə.

**BOZ**[1] *sif.* 1. Kül rəngli, qara rənglə ağ rəngin qarışmasından əmələ gələn (rəng). *Boz torpaq. Boz at. Boz qurd. – Həyətdəki sarı dirəyə ombaları çıxmış bir boz at bağlanmışdı.* S.Rəhimov. *..Boz qanqallar da çiçək açmışdır.* İ.Əfəndiyev. [Mahmud:] *Kəndimizin, onun boz çinarlarının, sərin bulaqlarının əvəzi varmı?* Z. Xəlil.

2. Tutqun, dumanlı, çiskin. [Hacı Murad:] *Sabah, Allah qoysa, qurtarrıq, hava da bozdur; bu dəxi yaxşıdır.* N.Vəzirov. *Səhərə məxsus ruzgar, yaşıl təpələrin üzərinə çəkilən dumanların boz yorğanını* [atdı].. M.S.Ordubadi.

3. Bitkisiz, çılpaq. *Boz çöllər. Boz yerdə ot bitməz. – Parça-parça düşərək quşbaşı göydən yerə qar; Sarılır ağ mitilə boz dərə, çöllər, dağlar.* A.Şaiq. *Buruqlarım hayqıraraq, nərə salır boz çöllərə.* S.Vurğun.

4. *məc. dan.* Utanmaz, nəzakətsiz, həyasız, çəkinməyən, sərt, qaba danışan. *Boz adam.*

◊ **Boz sifət göstərmək** – üzə bozarmaq, nəzakətsizlik etmək, özünü qaba, ədəbsiz aparmaq. *Qəhrəmanın ciddi təkidi müqabilində Rüstəm acıqlanır, ona boz sifət göstərirdi.* S.Rəhimov.

**BOZ**[2] *is.* Qırqovulun dişisi.

**BOZ**[3] *is. tib.* Dəmrova oxşar dəri xəstəliyi, keçəllik.

**BOZAQ**[1] *is.* 1. *bot.* Şoran torpaqlarda bitən birillik yem bitkisi.

2. Bu cür ot bitən yer.

3. Boz. *Qızıl qayanın üstündə olan silsilə dağları bozaq duman basırdı.* S.Rəhimov.

**BOZAQ²** *is.* Qabayunlu Azərbaycan qoyunu cinsi.

**BOZAQGÜLÜ** *is. bot.* Bozqırlarda, yamaclarda bitən çoxillik ot bitki.

**BOZALAQ** *is. bot.* Baldırı enli, yarpağı bozumtul alaq otu. *Bozalaq Azərbaycanda, demək olar ki, bütün rayonlarda yayılmış alaq bitkilərindəndir.* Qədirov.

**BOZARAQ** *sif.* Boz, bozumtul. *Bozaraq pərdə çox qalın olduğu üçün burada oturanlar çətin .. seçilirdi.* Ə.Əbülhəsən.

**BOZARAN** *f.sif.* 1. Tez solan. *Bozaran parça.*

2. Boz rəngdə görünən. *Uzaqda bozaran dağın yamacları. – Daz başlar kimi bozaran .. binalar kəndin görkəmini korlayırdı.* Ə.Əbülhəsən.

**BOZARANTI** *is.* 1. Havanın səhərə yaxın alaqaranlıq halı.

2. Uzaqdan boz görünən şey, yer.

**BOZARIŞMA** "Bozarışmaq"dan *f.is.*

**BOZARIŞMAQ** *f.* 1. Bir-bir bozarmaq, yavaş-yavaş bozarmaq, solub boz rəng almaq. *Taxıllar bozarışmağa başlamışdır.*

2. Görünmək (boz şey haqqında). *Qoyun sürüsü uzaqdan bozarışır.*

**BOZARMA** "Bozarmaq"dan *f.is.*

**BOZARMAQ** *f.* 1. Boz rəng almaq, bozlaşmaq. *Qadın qoca olduğuna və saçlarının tamamilə bozardığına baxmayaraq, çöhrəsində görünən təravət onun gənclikdə malik olduğu gözəlliyi andırırdı.* M.S.Ordubadi. // Solmaq, rəngi qaçmaq, rəngi getmək. *Qızın rəngi gül kimi bozarmışdı.* M.Hüseyn.

2. Yetişməyə başlamaq, biçilmək (dərilmək) vaxtı çatmaq. *Arpalar bozarmışdır. Qarpızlar yavaş-yavaş bozarır.*

3. Çiskinləşmək, tutqunlaşmaq; soyuqlaşmağa başlamaq, duman və soyuq olmaq. *Havalar bozarmışdır; Ağ saqqallı qış gəlir.* S.Rüstəm. *Payız fəsli olduğu üçün hava yaman bozarmışdı.* P.Makulu. // Yaxınlaşmaq, əlamətləri görünməyə başlamaq. *Payız bozarır, dağüstü şəhərinin özündə və ətrafında meşələrdə ağaclar lütləşir.* S.Rəhimov.

4. Bişməyə, qovrulmağa başlamaq. *Ət lap bozarıb, indicə xörək hazır olacaq.*

5. *məc.* Üzə qabarmaq; hörmətsizcəsinə, ədəbsizcəsinə, qabacasına cavab vermək, acıqlanmaq. *Həsənov yenə bozarmaq istəyir, lakin cəsarət etməyib susur.* M.İbrahimov. *Tahir dostunun yanında pərtliyini gizlədə bilməyib, anasının üstünə bozardı...* M.Hüseyn.

◊ **Qızarıb-bozarmaq** – b a x **qızarmaq**.

**BOZARMIŞ** *f.sif.* Boz hala gəlmiş, rəngi dönmüş, boz olmuş. *Soyuqdan bozarmış əllər. Gündən bozarmış yarpaqlar.* – [Rəfizadənin] *.. sürtükünün bozarmış mahudu ilə şəvə kimi parlayan atlaz yaxalıq bir-birinə uymurdu.* M.S.Ordubadi. [Kor kişinin] *yıpranmış vücudu, bozarmış saç-saqqalı yaşının əllidən artıqlığını .. bildirirdi.* S.Hüseyn.

**BOZARTI** *is.* 1. Bozarmış rəng.

2. Uzaqdan görünən boz rəngli şey.

**BOZARTMA** 1. *is.* Yağlı ətdən bişirilən sulu qovurma; bozqovurma. [Şəhrəbanı xanım:] *Nahara Müsyö Jordana qaymaq gərək, yağ gərək, axşama plov gərək, bozartma gərək ki, gedib öz ölkəsində deməsin ki, Qarabağ elatının arvadları mərifətsiz olurlar.* M.F.Axundzadə. *Gecəni qiyamət keçirirdilər. Erkək ətin bozartması, soğan, sirkə...* Mir Cəlal. □ **Çoban bozartması** – ala-çiy bişirilmiş sulu qovurma.

2. "Bozartmaq"dan *f.is.*

**BOZARTMAQ** *f.* 1. Boz etmək, boz rəng vermək. *Rəngsaz divarı bozartdı.*

2. Soldurmaq. *Paltarını günün altında bozartmaq.*

3. Yetişdirmək. *İsti arpaları bozardır.*

4. Ala-çiy bişirmək, yüngülvari qovurmaq. *Əti bozartmaq.*

5. *məc.* Utandırmaq.

◊ **Sifətini (üzünü) bozartmaq** – üzünün ifadəsini sərtləşdirmək, ciddiləşdirmək, qaşqabağını sallamaq. *Nəbi üzünü bozardıb dedi: – Sən bizdən nə istəyirsən?* "Qaçaq Nəbi". *..Yasavul adamlarla görüşdükdə, qabaqcadan sifətini bozardır, "böyük iş adamı" kimi sifət alır, adamları qabaqlayırdı.* S.Rəhimov.

**BOZBAŞ** *is.* Ət, noxud, kartof ilə bişirilən sulu xörək; piti. [Telli:] – *Ay Pərzad xala, – dedi, – yeri onları da yığ gətir bir yerdə yeyək, bozbaş asmışam.* Çəmənzəminli.

*Bozbaşı qoyun ətindən, özü də maça və döş hissəsindən bişirərdilər.* H.Sarabski.

**BOZBAŞLIQ** *sif.* Bozbaşa yarayan. *Bozbaşlıq ət.*

**BOZDAR** *is. məh.* Boztüklü qoyun itinə verilən ad.

**BOZQIR** *is.* Susuz, otsuz çöl.

**BOZQIRLAŞMA** "Bozqırlaşmaq"dan *f.is.*

**BOZQIRLAŞMAQ** *f.* Bozqır halına gəlmək.

**BOZQIZILAĞACI** *is. bot.* Hündür kol və ya ağac şəklində bitki. *Bu bitkinin gövdəsi açıq-sarı rəngli qabıqla örtülmüşdür; sıra ilə düzülmüş yumurtaşəkilli yarpaqlarının kənarı ikiqat dişlidir.* Əliyev.

**BOZQOVURMA** *is. aşp.* bax **bozartma** 1-ci mənada.

**BOZLAMAC** *is. məh.* Sacda bişirilən qalın yayma.

**BOZLAMAQ** *f. məh.* Uca səslə, oxşaya-oxşaya ağlamaq.

**BOZTÖVR** *köhn.* bax **bozumtul.** *Daşlıqlara çıxan dovşanların balalarının arasında bəzinin rəngi tünd-yaşıl və bəzinki bir az boztövr olacaq.* H.Zərdabi.

**BOZUMSOV** bax **bozumtul.**

**BOZUMSOVLUQ** bax **bozumtulluq.**

**BOZUMTRAQ** bax **bozumtul.** *Kəndin mərkəzindəki bozumtraq bir minarəni yalayıb gələn gilavar küləyi .. məhzun və mükəddər nəğməsini çalırdı.* H.Nəzərli.

**BOZUMTUL** *sif.* Boza çalan, boza yaxın, bir qədər boz. *Günəş çoxdan bozumtul buludlar arasında üzməkdə idi.* M.Hüseyn.

**BOZUMTULLUQ** *mücər.* Bozumtul şeyin halı.

**BÖ(V)** bax **böyə.**

**BÖCƏK** *is.* [*ər.*] Sərtqanadlı kiçik cücü. *Qutunun içində altı cərgə səliqə ilə kəpənək, çəyirtkə və qeyri böcəklər kağıza sancılı halda düzülmüşdü.* Ə.Vəliyev. *Hörümçək hər hansı bir yaxın budaqdan torpağa qədər sap uzadaraq, onun ortasında dayanır və uçan böcəyin həmin sapı nə zaman yellədəcəyini səbirlə gözləyir.* Ə.Haqverdiyev.

**BÖHRAN** *is.* [*ər.*] 1. *iqtis.* Xırda istehsalatçıların iflasına, istehsalın azalmasına səbəb olan dövraşırı nisbi həddən artıq əmtəə istehsalı. *İqtisadi böhran. Sənaye böhranı. Aqrar böhranı.*

2. Qıtlıq. *Yanacaq böhranı.*

3. *tib.* Xəstəliyin gedişində xəstənin vəziyyətinin ya yaxşılaşması, ya da pisləşməsi ilə nəticələnən dönüş nöqtəsi. *Qızılcanın böhran dövrü. – Var ümidim ki, gələ bir sənə səhhət tapasan; Gözləyir təbibin hələ böhran, Yusif!* S.Ə.Şirvani. [Gülcahan:] *Həkim gündə iki dəfə gəlir... On birinci günündə böhran olacaq* [deyir] N.Vəzirov.

4. *məc.* Bir şeyin gedişində sərt dönüş, kəskin dəyişiklik. [Müəllim:] *Xüsusən uşaq on dörd, on beş yaşlarında ikən çox mühüm bir böhran keçirmək zamanıdır.* A.Şaiq. // Ümumiyyətlə, ağır vəziyyət, ağır hal. [Şirin] *əsəbi bir böhran keçirir.* İ.Əfəndiyev.

◊ **Siyasi böhran** – ölkədə xalq kütlələrinin hökumətin siyasətindən qəti surətdə narazı qaldığını göstərən siyasi vəziyyət. **Hökumət** (yaxud **kabinə**) böhranı – köhnə hökumətin istefaya çıxması məsələsi həll olunub, yeni hökumətin isə hələ düzəldilməmiş olduğu dövr.

**BÖHRANLI** *sif.* Çox qarışıq, çox ağır, qorxulu. *Xəstə böhranlı hal keçirir.* – [Əbülhəsən bəy:] *Bundan böhranlı, bundan ümidsiz bir dəqiqə görməmişdim.* M.S.Ordubadi.

**BÖHT** *is.* [*ər.*] Heyrət, təəccüb, mat qalma, çaşıb qalma, çaşqınlıq. *..Böhtün içində onun* [Hacı Xəlilin] *keçən günləri bir-bir gəlib gözünün qabağından ötürdü.* Ə.Haqverdiyev. *Rəssam heyrət və böht içində dayanıb dinləyirdi.* İ.Əfəndiyev. ☐ **Böht aparmaq (almaq)** – mat qalmaq, heyrətə düşmək, fikrə getmək. *Bu sözü eşidəndə məni böht aparıb: bilmirdim inanım bu xəbərə, ya inanmayım.* C.Məmmədquluzadə. *Sarğı gözündən açılıb içəri girdikdə, Qulamı böht aldı.* Ə.Əbülhəsən. **Böhtə getmək** – bax **böht aparmaq (almaq)**. *Ağa Hüseyn Xəlilin bu sözlərini eşidib, bir an böhtə gedib dedi..* Ə.Haqverdiyev. *Büllur Nisəxanımın xoşuna gəlməyən bir də ərinin bu xasiyyəti – "içində danışmağı", "böhtə getməyi" idi.* Mir Cəlal.

**BÖHTAN** *is.* [*ər.*] Birini ləkələmək üçün nahaqdan ona pis bir şey isnad etmə; iftira, şər. *Həqqa ki, deyil bu nüktə böhtan; İsbatinə vardır əldə bürhan.* Məsihi. [Heydər bəy:] *Naçalnik, tamam danışdığı sözlər böhtandır.* M.F.Axundzadə. *Uryadnik bir-iki dəfə onu*

*şapalaqladı, yenə də Ağabala böhtana qol qoymadı.* Şamilov. ◻ **Böhtan atmaq** – birinə olmayan bir işi və ya sözü isnad vermək; iftira demək, ləkə vurmaq. **Böhtan demək (etmək)** – b a x **böhtan atmaq**. [Vəzir:] *Məgər heç utanmırsan ki, mənim üzümə qarşı arvadıma böhtan deyirsən?* M.F.Axundzadə. **Böhtana düşmək** – nahaqdan şərə düşmək, iftiraya məruz qalmaq. *Böhtana düşən odsuz yanar*. (Ata. sözü). *Məsum kişi ağır bir böhtana düşmüşdü.* Mir Cəlal.

**BÖHTANÇI** *is*. Böhtan söyləyən, böhtanla məşğul olan, başqasının üstünə böhtan atan, şər atan adam; iftiraçı. *Böhtançını məsuliyyətə cəlb etdilər.* – [Hakimi-şər:] *Mən dedimmi ki, bu zəifə mənim nəzərimə böhtançı gəlir?* M.F.Axundzadə. // Sif. mənasında. *Böhtançı adam. – Səlim yüz cür böhtançı materiallarla Dilaranı məktəbdən və partiyadan qovdurdu.* M.İbrahimov.

**BÖHTANÇILIQ** *is.* Böhtan atma, iftira etmə, iftiraçılıq; böhtançının işi, peşəsi, xasiyyəti. *Böhtançılıq üstə işdən çıxarıldı.*

**BÖLƏN** *is.* Bölmə əməlində: bölünən kəmiyyətin bölündüyü ədəd; məs.: 50:5=10 əməlində 5 bölən ədəd adlanır.

**BÖLGƏ**[1] *is. zool.* Nərə balığının bir növü, beluqa.

**BÖLGƏ**[2] *is.* Müəyyən əlamətə görə seçilən ərazi sahəsi.

**BÖLGÜ** *is.* 1. Bölmək işi. *Məhsul bölgüsü. Əmək bölgüsü. İş bölgüsü. Gəlir bölgüsü.*

2. Dərəcələrə bölünmüş cihaz və s. *Bölgü qıfı. Bölgü cədvəli.* // Cihaz və s. üzərindəki dərəcələr. *İndikator diaqramı üzərindəki bölgülər göstərici bölgülərin eynidir.* Quliyev.

**BÖLMƏ** *is.* 1. "Bölmək"dən *f. is*

2. Riyaziyyatda: bir sayda neçə dəfə başqa say (ədəd) olduğunu bilmə əməli. *Bölmə əməli. Bölmə cədvəli.*

3. İdarə, təşkilat və ya müəssisənin iri şöbəsi; seksiya. *Trestin istehsalat bölməsi.*

4. Kiçik əsgəri hissə. *Bölməmiz çətinliklə irəliləyirdi, çünki düşmən cinahdakı atəş nöqtəsindən güclü atəş açırdı.* M.Hüseyn. *İldırım qabaqdaydı bölmə hücum edəndə.* S.Rüstəm. *Silahlı qüvvələrimizin bütün birləşmə, hissə və bölmələrinin komandirləri öz hissələrinin tam ixtiyarlı rəisləridirlər.* (Qəzetlərdən).

5. Bir şeyin, yaxud yerin və s.-nin bölündüyü hissələrdən hər biri. *Bina bölmələrə ayrılmışdı. Qəfəsənin bölmələri.*

**BÖLMƏK** *f.* 1. Bir şeyi parçalara, hissələrə, paylara ayırmaq. *Əmlakı bölmək. Şagirdləri qruplara bölmək. // riyaz.* Bölmə əməliyyatı icra etmək. *İyirmini dördə bölmək.*

2. Arasını kəsmək, ayırmaq. *Otağı iki yerə bölmək. Bağçanı ortasından bölmək. Tən yarı bölmək.*

**BÖLÜCÜ** *is.* Hissələrə bölən, ayıran; təqsim edən.

**BÖLÜK** *is.* 1. Piyada və bəzi xüsusi qoşun hissələrində batalyon tərkibinə daxil olan əsgəri hissə; rota. *Diviziyanın alayları, hər alayın bölükləri kənd aralarında, meşəliklərdə, dağda-daşda yerləşmişdi.* S.Rəhimov.

2. Parça, tikə, hissə. *Tağı əmi* [bildirçini] *qırğının əlindən alıb başını kəsdi. Sonra iki bölük edərək tulalara atdı..* S.S.Axundov.

3. "Bir" sözü ilə: **bir bölük** – bir yığın, bir sürü, bir dəstə; çoxlu. *Bir bölük yaşılbaş sonalar kimi; Yığılıb gəlibdir Qazağa qızlar.* M.P.Vaqif. *Bir bölük atlar; Atlar göy otlar.* A.Səhhət. [Məşədi Cəfər:] *Məndən sonra bir bölük yetim-yesir qalacaq.* Ə.Haqverdiyev. *Bir tək donluq ilə Mirzə yazıq özünü saxlasın, yoxsa pul göndərib bir bölük, külfətini dolandırsın.* S.Rəhimov.

**bölük-bölük** *zərf* Dəstə-dəstə, dəstələr halında. *Adamlar bölük-bölük gəldilər. – Bölük-bölük, dəstə-dəstə qızınan; Sonam göldə üzən yerdir bu yerlər.* Aşıq Kərəm.

**BÖLÜM** *is.* 1. Bölmə işi.

2. Parça; bölünmüş hissə; pay, hissə.

**bölüm-bölüm** *zərf* Parça-parça, hissə-hissə, tikə-tikə. *Bölüm-bölüm olmaq.*

**BÖLÜNƏN** *f.sif.* 1. Parçalanan, hissələrə ayrılan.

2. *riyaz.* Bölmə əməlində: bölünən ədədin adı; məs.: 10:5 = 2 əməlində 10 bölünəndir.

**BÖLÜNMƏ** "Bölünmək"dən *f.is.*

**BÖLÜNMƏK** *f.* 1. Parçalanmaq, xırdalanmaq, hissələrə ayrılmaq. *Hüceyrələr bölünüb artır. Buz ikiyə bölündü.*

2. *riyaz.* Qalıqsız başqa ədədə bölünə bilmək. *On beşə bölünür.*

3. Ayrılmaq. *Dəstəmiz bir meşənin yanında üç hissəyə bölündü.*

4. *məch.* Paylaşdırılmaq, bölüşdürülmək. *Vəzifələr kollektivin üzvləri arasında bölündü.*

**BÖLÜNMƏZ** *sif.* 1. Qalıqsız bölünə bilməyən. *Bölünməz ədəd.*

2. Bölünməli olmayan.

3. Parçalanmayan, hissələrə ayrıla bilməyən; bütöv. *Keçmişdə atomlar materiyanın bölünməz hissələri hesab edilirdi.*

**BÖLÜNMƏZLİK** *is.* Bölünə bilməmə, parçalana bilməmə, hissələrə ayrıla bilməmə; bütövlük, tamamlıq, yekparəlik.

**BÖLÜŞ** *is.* Bölünmə, ya bölmə qaydası, tərzi, üsulu. *Bu bölüş heç xoşuma gəlmədi.*

**BÖLÜŞDÜRMƏ** "Bölüşdürmək"dən *f.is.*

**BÖLÜŞDÜRMƏK** *f.* Bir şeyi və ya işi bir neçə adam və s. arasında bölmək, yaxud öz aralarında paylaşdırmaq. *Malı bölüşdürmək. Məhsulu bölüşdürmək.* // Hissələrə bölmək.

**BÖLÜŞDÜRÜCÜ** *sif.* və *is.* Təqsim edən, bölüşdürən.

**BÖLÜŞDÜRÜLMƏ** "Bölüşdürülmək"dən *f.is. Vaxtın düzgün bölüşdürülməsi.*

**BÖLÜŞDÜRÜLMƏK** *məch.* 1. Bir neçə adam və s. arasında, yaxud öz aralarında bölünmək, paylaşdırılmaq. *Bu günlərdə məhsul bölüşdürüləcəkdir.*

2. Hissələrə bölünmək.

**BÖLÜŞMƏ** "Bölüşmək"dən *f.is.*

**BÖLÜŞMƏK** *qarş.* Bir şeyi öz aralarında bölmək, təqsim etmək, paylaşdırmaq, yaxud bir şeydən bir hissə özünə götürüb, qalanını başqasına və ya başqalarına vermək. *Qaraca qız çox rəhmdil və səxavətli qız idi. Hər nə əlinə düşsə idi, yoldaşları ilə bölüşərdi.* S.S.Axundov. *Üzün aydın, ağ tellərin yumşaq; Dərdlərini gəl mənimlə bölüş, ay*! H.K.Sanılı.

**BÖRK** *is.* Papaq, baş geyimi. *Mollanın börkünü çalıb oğru; Yüyürüb qaçdı bir bağa doğru.* M.Ə.Sabir. [Xudayar bəy:] *Kişi börkünü başına nədən ötrü qoyur? Ondan ötrü qoyur ki, ona kişi desinlər.* C.Məmmədquluzadə. ☐ **Börkünü göyə atmaq** – b a x **papağını göyə atmaq** (**"papaq"** sözündə). *Kəblə İmaməli, .. Məşədi Bayram o qədər sevindilər ki, az qalırdılar börklərini göyə atalar.* C.Məmmədquluzadə.

**BÖRKÇÜ** *is.* Papaqçı. *Börkçünün börkü olmaz, kürkçünün kürkü.* (Ata. sözü).

**BÖRKQAPAN** *is.* Keçmişdə papaqla oynanılan bir oyun adı; papaqaldıqaç.

**BÖRKLÜ** *sif.* Papaqlı, başında börk olan.

**BÖVL** *is.* [*ər.*] *köhn.* Sidik. ☐ **Bövl etmək** – işəmək. *Ağacın altında, suyun qırağında bövl etmək yaxşı deyil.* C.Məmmədquluzadə.

**BÖYƏ** *is. zool.* Hörümçəyəoxşar zəhərli cücü.

**BÖYƏLƏK** *is. zool.* Heyvanların qanı və bitkilərin şirəsi ilə dolanan iri çibin.

**BÖYƏLƏKÇİ** *is. məh.* Hiyləbaz, araqızışdıran. [Həzrətqulu:] *Nə vaxtacan bu Həsən kişi xalqın başına böyələkçi olacaq?* Ə.Haqverdiyev.

**BÖYƏLƏKLƏNDİRMƏK** *f. məh.* Acıqlandırmaq, qızışdırmaq.

**BÖYƏLƏKLƏNMƏK** *f. məh.* 1. Böyələk sancmasından qaçmaq, şıllaq atmaq (heyvanlar haqqında) .

2. *məc.* Acıqlanmaq, dalaşmaq istəmək.

**BÖYƏMƏK** *f. məh.* Suyu gölləndirmək üçün arxın, çayın qabağını kəsmək.

**BÖYƏNMƏK** *f. məh.* Yığılıb qalmaq; qabağı kəsilmək, qabağı bağlanmaq.

**BÖYLƏ** *köhn.* b a x **belə**. *İnsan da olurmu böylə incə; Ey şux, məgər ki, huri-eynsən?* Heyran xanım. *Hacı Saleh qızı böylə camal sahibi görüb, oğlu Əsgərə təklif etdi ki, Züleyxanı alsın.* C.Cabbarlı. *Dedim, igid ömrü böylə bitirməz...* R.Rza.

**BÖYRƏK** *is. anat.* İnsan və heyvanlarda: sidik ifraz edən bədən üzvü. *Böyrək xəstəliyi. Sağ böyrək.*

**BÖYRƏKCİK** *is.* Kiçik böyrək.

**BÖYRƏKLİ** *sif. məh.* Qoçaq, ürəkli.

**BÖYRƏKÜSTÜ** *sif. anat.* Böyrəklərin üstündə yerləşən. *Böyrəküstü vəzilər.*

**BÖYÜCÜK** *sif.* Çox böyük, olduqca böyük. *..Qanbur bir ixtiyar əlində böyücük bir büt yonur.* H.Cavid. // Bir qədər böyük.

**BÖYÜDÜCÜ** *sif. xüs.* Böyük göstərən, iri göstərən. *Böyüdücü şüşə. Böyüdücü cihaz.*

**BÖYÜDÜLMƏ** "Böyüdülmək"dən *f.is.*

**BÖYÜDÜLMƏK** *məch.* 1. Böyük hala salınmaq. *Şəkil 4 dəfə böyüdülmüşdür.*

2. Tərbiyələndirilmək, (bəslənib) yetişdirilmək.

3. Vəzifəsi artırılmaq, yüksəldilmək.

**BÖYÜDÜLMÜŞ** *f.sif.* 1. Böyük hala salınmış, iriləşdirilmiş. *Böyüdülmüş şəkil. Mikroskop altında böyüdülmüş mikrob.*

2. Şişirdilmiş. Böyüdülmüş məsələ.

**BÖYÜK** *sif.* 1. Kəmiyyətcə, ölçücə yekə, iri (*kiçik* ziddi). *Böyük daş. Böyük şəhər. Böyük ev. – Ağarza yoldan kənara çəkilib, böyük və soyuq bir daş üstündə oturdu.* Mir Cəlal. [Göyərçin:] *İsmayılzadə deyir ki, bu il böyük bir saray tikəcəyik...* Z.Xəlil. // Geniş, vüsətli. *Böyük meydan. Böyük sahə.*

2. Bəzi isimlərin qabağında gücləndirici məna daşıyır. *Böyük fayda. Böyük sürət. Böyük məmnuniyyətlə. Böyük maraq. Böyük dərd. Böyük arzu. Böyük sevinc. Böyük ləzzət. Böyük həvəslə. Böyük minnətdarlıq hissi ilə. – Qəhrəman həqiqətən anası Gülüşgəlindən də böyük nəvazişlər görmüşdü.* S.Rəhimov. *Sözlər aydın, fikir dərin; Məna böyük, məktub qısa.* R.Rza.

3. Çox güclü, çox şiddətli. *Böyük tufan. Böyük daşqın. Böyük yanğın.*

4. Yaşca o birindən artıq olan. *Böyük qardaş. Böyük oğul. Böyük bacı. // İs. mənasında.* Yaşlı, qoca (çox vaxt cəm şəklində işlənir). *Böyüklərə hörmət lazımdır. – Aqil böyüklərə məxsus bir ədəblə çəngəl-bıçaq almış, çörəyini, xörəyini qabağına çəkmişdi.* Mir Cəlal. *Şirmayı böyüklərin söhbətinə qulaq asmağa sonsuz bir maraq göstərirdi.* M.Hüseyn. *Elə bir zamandan danışıram ki, böyüklərin xatirəsində çox yaxşı qalıb, kiçiklərin isə heç ağlına gəlməz.* S.Rəhman. ☐ **Böyüklə böyük, kiçiklə kiçik** – hər kəslə yola gedən, hər şeyin məqamını bilən, hörmətcil adam haqqında. *Yeri gələndə* [Möhsün bəy] *böyüklə böyük, kiçiklə kiçik idi.* S.Rəhimov.

5. Sayca çox, külli miqdarda olan. *Böyük dəstə. Böyük kapital. Böyük məbləğ. Böyük ailə.* // İzdihamlı, qələbəlik, təntənəli, dəbdəbəli, əzəmətli. *Böyük ziyafət. Böyük qonaqlıq. Böyük nümayiş.*

6. Fövqəladə tarixi və siyasi əhəmiyyəti olan. // Elm, ədəbiyyat və incəsənət əsərləri haqqında. *Azərbaycan klassik ədəbiyyatının böyük əsərləri. Yazıçılarımız, bəstəkarlarımız əsrimizə layiq böyük əsərlər yaratmışlar.*

7. Dahi, ulu, xariqüladə zəka sahibi olan. *Böyük Nizami. Böyük rəhbər. Böyük sərkərdə. Böyük insan.* // Tarixdə çox görkəmli rol oynamış şəxsiyyətlərin adlarına əlavə edilən epitet. *Böyük Pyotr. Böyük İsgəndər.* // Görkəmli, məşhur ad və hörmət qazanmış. *Səy elə sən də böyük insan ol; Doğruluqla bu ada şayan ol!* A.Səhhət. [Tamam:] *Sən heç kəsə qulaq asma, get oxu, böyük adam ol.* S.S.Axundov. // Mahir. *Öz işində böyük ustadır.*

8. Çox mühüm, əhəmiyyətli, vacib. *Böyük iş. Böyük məsələ. – Böyük günlər, şanlı günlər, şən günlər; Yoluna düşən günlər; Hələ qarşımızdadır.* M.Müşfiq. [Şair] *Afaqı tapmaq, onu görmək, ona deyilməmiş böyük sözünü demək istədi.* Ə.Məmmədxanlı.

9. *is. dan.* Başçı, rəis, rəhbər; başda duran, idarə edən adam, yüksək vəzifə sahibi. *Ailənin böyüyü kimdir? Qoşun böyüyü. – Böyüklərdə güc olar, yalan olmaz.* (Ata. sözü). *Kənddə qiyamətdi.. Naçalnik gəlib kəndə. Yanınca o qədər böyük gəlib ki, lap məəttəl qalmalı işdi.* C.Məmmədquluzadə. *İndi Hacı Əsgər mötəbər şirkətin bani və böyüyü hesab olunur.* S.M.Qənizadə.

**böyük-böyük** 1. *zərf* Yekə-yekə, lovğa-lovğa. *Böyük-böyük danışmaq.*

2. *sif.* Böyüklük və eyni zamanda çoxluq göstərir. *Böyük-böyük evlər. Qarşımızda böyük-böyük məsələlər durmuşdur. Çöllərdə böyük-böyük sürülər otlayır.*

**BÖYÜKCƏ** *sif.* Çox böyük, yaxud bir qədər böyük. *Qısaboylu, böyükcə burunlu, çuxura düşmüş gözlü bu adamın .. boz saçları boynunun ardına tökülmüşdü.* H.Nəzərli.

**BÖYÜK-KİÇİK** *is.* 1. Yaşlarından asılı olmayaraq hamı. [Sarxan] *daima lətifələrlə danışar, böyük-kiçiyə baxmadan zarafat eləməyi sevərdi*. M.İbrahimov. *Böyük-kiçik hamı çıxır.* Ə.Əbülhəsən. // Bəzən "böyüklü-kiçikli" şəklində işlənir. *Böyüklü-kiçikli, hamı küçələrə çıxdı.* S.Rəhimov.

2. Vəzifəcə, yaşca böyük və kiçik olanlar. *Yasavul böyüməsinə baxmayaraq, böyük-kiçik tanıyır, yuxarının qabağında daha artıq xidmət göstərir.* S.Rəhimov.

**BÖYÜKLƏNMƏK** *f.* 1. Özünü böyük göstərmək, iddia satmaq, böyüklük etmək istəmək, başqalarını özünə tabe etmək istəmək.

2. Vəzifəsi böyümək, rütbəsi artmaq. *Dönüb pristav olandan sonra dedim, böyükləndi, daha mənə baş qoşmaz.* S.Rəhimov.

**BÖYÜKLÜK** "Böyük"dən (1, 2, 5, 6 və 8-ci mənalarda) *mücər. Evin böyüklüyü. Dalğanın böyüklüyü. Dənizin böyüklüyü. Meşənin böyüklüyü. – Xalqın böyüklüyü onun sayı ilə təyin edilmir, bəlkə tarixdəki müsbət rolu ilə təyin edilir.* M.Hüseyn. *Gördüyü sonsuz iztirablar içərisində ..* [Ulduz] *insanın böyüklüyü və ruhi qüdrətini kəşf etdi.* Ə.Məmmədxanlı.

□ **Böyüklük etmək** – 1) yol göstərmək, qayğısına qalmaq. [Mahmuda] *böyüklük edən olmadı.* Z.Xəlil; 2) buyurmaq, əmr etmək, göstəriş vermək. [Kərim:] *Heç vaxt sənin həddin yoxdur ki, o qıza böyüklük edəsən!* M.F.Axundzadə. **Böyüklük satmaq** – təşəxxüslənmək, qürurlanmaq, kibrlənmək, lovğalanmaq, özünü böyük göstərməyə çalışmaq.

**BÖYÜKRAQ** *müq.dər. köhn.* Bir qədər böyük.

**BÖYÜKSÜZ** *sif.* Başçısız, böyüyü, baxıcısı olmayan; hamisiz. *Böyüksüz evdə xeyir-bərəkət olmaz.* (Ata. sözü).

**BÖYÜKSÜZLÜK** *is.* Baxıcısızlıq, hamisizlik.

**BÖYÜKYANA** *zərf* Böyük-böyük, yekə-yekə, lovğa-lovğa. [Hikmət İsfahani] *aramla və böyükyana danışmağa başladı.* M.İbrahimov.

**BÖYÜKYAŞLI** *sif.* Yaşca o birilərindən böyük olan. *Böyükyaşlı uşaqlar.* // İs. mənasında. *Böyükyaşlılar arasında keçirilən ümumittifaq yarışları.*

**BÖYÜMƏ** "Böyümək"dən *f.is.*

**BÖYÜMƏK** *f.* 1. Həcmcə və ya miqdarca artmaq, genişlənmək. *Şiş böyümüşdür. Mikroskop altında mikrob yüz dəfə böyümüşdür. Sürülər xeyli böyümüşdür. – Al rənglər getdikcə artır, böyüyür, bir məşəl, bir azadlıq günəşi kimi bütün dünyanı işıqlandırır.* M.İbrahimov.

2. Artmaq, şiddətlənmək, güclənmək, qüvvətlənmək. *Mübahisə böyüdü. Qovğa böyüdü. Söhbət böyüdü. – Narazılıq çox zaman böyüyər və ədavətə çevrilərdi.* H.Sarabski.

3. Boy atmaq, uzanmaq, yetişmək, inkişaf etmək. *Uşaqlar böyüyür. Evkalipt ağacı çox tez böyüyür. Taxıllar bu il çox gec böyüdü.*

4. Hər hansı bir yerdə ömür keçirmək, yaşamaq, cavanlığını, uşaqlığını keçirmək. *Uşaq yaxşı mühitdə böyüyür. – Girdman dağlarının təmiz havasında böyümüş bu qocanın yetmiş yaşı vardısa da, hələ qocalmaqdan şikayət etmirdi.* M.Hüseyn.

5. Vəzifəsi, rütbəsi, nüfuzu, hörməti artmaq; yüksəlmək. *Onun vəzifəsi böyümüşdür.* – [Zeynəb:] *İndi böyümüsən, daha bizə etina göstərməyirsən.* B.Talıblı.

**BÖYÜR** *is.* 1. Bədənin çiynindən ombaya qədər olan sağ və sol tərəfi. *Böyrü əzilmək. Böyrü üstə uzanmaq. – Namərd güllə yazıq uşağın sol böyründən dəyib, kürəyindən çıxmışdı.* S.S.Axundov. *Uşaq yumaq kimi bükülüb, böyrü üstə yıxılmışdı.* Ə.Məmmədxanlı. // Heyvanlar haqqında. *İnəyin böyrü batmışdır.*

2. Yan. *Qab böyrü üstə düşdü.* – [Məmməd:] *Bütün köhnə, böyrü üstə əyilmiş Cəmbərəkəndi yox olmuşdur.* C.Cabbarlı. *Qayıq dəniz buruqlarının, böyründən şütüyərək açıq dənizə çıxdı.* M.Hüseyn.

◊ **Böyrü üstə yatmaq** – heç bir iş görməmək, tənbəllik etmək. **Böyrünü yerə vurmaq** – 1) yan üstə uzanmaq. *Böyrün yerə vurub çoban dağ üstə; Hərdən deyir bir yanıqlı şikəstə.* A.Səhhət; 2) b a x **böyrü üstə yatmaq**. **Böyürdən törəmə** – gözlənmədən meydana çıxan şey haqqında. **Böyürdən çıxmaq** – gözlənmədən ortaya çıxmaq. **Əlini böyrünə vurmaq** – b a x **böyrü üstə yatmaq**.

**böyür-böyürə** *zərf* Yan-yana, bir-birinin yanında, bir-birinə lap yaxın. *Böyür-böyürə oturmaq. Böyür-böyürə yaşayırsınız, bir-birinizdən xəbəriniz yoxdur. – Hatəm dayının nəzərləri .. gəlib çardaq altında böyür-böyürə vermiş dolu çuvallarda dayandı.* Mir Cəlal.

**BÖYÜRAĞRISI** *is. dan.* Əlavə qayğı, əngəl, narahatlıq, narahatedici şey. ☐ **Böyürağrısı olmaq** – narahat etmək, əngəl olmaq.

**BÖYÜRMƏ** “Böyürmək”dən *f.is. Atların kişnəməsi, qoyun-quzunun mələşməsi, inək və camışların böyürməsi .. bir uğultu təşkil edir..* Çəmənzəminli.

**BÖYÜRMƏK** *f.* 1. Bağırmaq (öküz, inək, camış, dana haqqında).

2. Qışqırmaq, pis səslə bağırmaq. *Böyürmə, insan kimi çığır.*

**BÖYÜRTKƏN** *is.* Tutabənzər meyvəsi olan yabanı kol bitki. [Cəmil] *böyürtkən kolları, çalı-çəpərlər arasından keçib kəndin yaşıl ağacları arasında gözdən itdi.* Mir Cəlal. // Bu bitkinin meyvəsi. *Yay fəslində ərik, gavalı, böyürtkən dəyərdi.* S.S.Axundov.

**BÖYÜRTKƏNLİK** *is.* Böyürtkən kolları bitən yer. *Dəmirov üzünü böyürtkənliyə tutub, Fətəlinin başını sığalladı.* S.Rəhimov.

**BÖYÜRTMƏ** “Böyürtmək”dən *f.is.*

**BÖYÜRTMƏK** *icb.* Böyürməsinə səbəb olmaq, qışqırtmaq, bağırtmaq.

**BÖYÜRTÜ** *is.* Öküz, dana kimi heyvanların çıxardığı səs. [Nəriman] *bir neçə həyət ötmüşdü ki, öküz böyürtüsü eşitdi. O tərəfə getdi.* Mir Cəlal. [Səmsamın] *yoğun səsi qışqırıqdan çox öküz böyürtüsünə bənzəyirdi.* P.Makulu.

**BÖYÜRÜŞMƏ** “Böyürüşmək”dən *f.is.*

**BÖYÜRÜŞMƏK** *qarş.* Bir yerdə, ağız-ağıza verib böyürmək.

**BÖYÜTDÜRMƏK** *icb.* Başqa şəxs vasitəsi ilə böyütmək. *Şəklini fotoqrafiyada böyütdürmək.*

**BÖYÜTMƏ** “Böyütmək”dən *f.is.*

**BÖYÜTMƏK** *f.* 1. Böyük eləmək, iriləşdirmək; genişləndirmək. *Şəkli böyütmək. Otaqların arasını açıb böyütmək. Bağın sahəsini böyütmək. – Əhməd elə fikir eləyirdi ki, .. özü qazandığı pulların köməyi ilə alverini böyüdəcək, bir neçə gündən sonra, birinci tacirlər sırasına daxil olacaqdır.* B.Talıblı. // İri, böyük göstərmək. *Mikroskop şeyləri dəfələrlə böyüdür.* // Mübaliğə etmək, şişirtmək. *Məsələni böyütmək lazım deyil.*

2. Boya-başa çatdırmaq, tərbiyələndirmək, yetişdirmək. *Qızı nənəsi böyütmüşdür. Uşaq böyütmək çətin işdir. – Məmməd uşaqlarını böyüdüb, müəyyən yaşa yetirdikdən sonra bunları məktəbə qoydu.* “Aşıq Qərib”. [Çimnaz:] *Bu daxmada sənin kimi qız, Bülənd kimi oğul böyütmüşəm ki, bütün dünyanın xəzinələrinə dəyişmərəm!* Ə.Əbülhəsən.

**BRA** *is.* [*fr.*] Divar şamdanı, qəndili.

**BRAK** [*alm.*] 1. Nöqsanlı, zədəli mal, zay və s. *İstehsalatda braka yol verilməməli.* ☐ **Brak etmək** – nöqsanlı olduğu üçün yaramaz hesab etmək. *Fabrikdə məhsullar yoxlanılır, yaramayanları brak edilir.*

2. Nöqsanlı, zədəli. *Brak şüşə. Brak mal.*

**BRAKÇI** *is. xüs.* İstehsalatda nöqsanlı, zədəli malları brak etməklə məşğul olan işçi.

**BRAKONYER** *is.* [*fr.*] İcazəsiz ov edən, balıq tutan; ovçuluq və balıqçılıq qanunlarını pozan.

**BRAUNÍNQ** [*ing. xüs. addan*] Xüsusi sistemli silah (tapança) növü. *Raya bir sillə onun ağzından vuraraq, .. brauninq tapançanı çıxardı.* M.S.Ordubadi. *Elmar .. brauninqi çıxarıb, cibinə qoydu.* İ.Əfəndiyev.

**BRÁVNİK** *dan.* bax **brauninq.** *Birinci kərə* [Rəşidin] *belində kiçik “bravnik” tapança görürdüm.* M.S.Ordubadi.

**BREZÉNT** [*holl.*] 1. Su keçirməyən qalın parça. *Un çuvallarının üstü brezentlə örtülmüşdür. – Böyük brezenti üstündən götürüb, tüfəngləri və patronları əncir ağacının altına yığdılar.* A.Şaiq.

2. Brezentdən hazırlanmış, brezentdən qayrılmış. *Brezent əlcək. Brezent ayaqqabı. – Qar çovğununda yol təmizləyən fəhlələr üçün brezent əlcəklər hazırlanmışdır.* (Qəzetlərdən). *Əlində tilov, başında şlyapa, ayağında brezent şalvar və köynək Əhmədibiqəm gəlir.* M.İbrahimov.

**BRƏHMƏ́N** *is.* [*sanskr.*] 1. Hindlilərin qədim dini olan brəhmən dininə mənsub adam.

2. Hindlilərin brəhmən rahibi, brəhmən kahini.

**BRƏHMƏNİZM** bax **brəhmənlik.**

**BRƏHMƏNLİK** *is.* Eramızdan qabaq X-IX əsrlərdə Hindistanda meydana gələrək, hindlilərin ən qədim dini olan vedizmi əvəz etmiş din.

**BRİFİNQ** *is.* [*ing.*] Bir mövzuda nəticə olaraq verilən məlumat və ya bəyanat; açıqlama.

**BRİKÉT** [*fr.*] Kərpic şəklində preslənmiş (sıxılmış) material. *Kömür briketi.*

**BRİKETLƏMƏ** "Briketləmək"dən *f.is.*

**BRİKETLƏMƏK** *f.* Briket (kərpic) şəklində presləmək, kərpic şəklinə salmaq.

**BRİKETLƏNMƏK** *məch.* Briket (kərpic) şəklində preslənmək, kərpic şəklinə salınmaq.

**BRİQÁDA** [*fr.*] 1. Bir neçə polkdan, batalyon, ya batareyadan ibarət qoşun birləşməsi. *Tank briqadası.* – *..Kazak briqadası İran hökumətinin ümidlərini boşa çıxardı.* M.S.Ordubadi. // Birtipli hərbi gəmilər birləşməsi. *Torpeda gəmiləri briqadası.*

2. Dəmir yolunda qatara xidmət edən işçilər heyəti. *Qatar briqadası.*

3. Zavodda, müəssisədə və s.-də müəyyən sahəyə aid olan istehsal tapşırıqlarını yerinə yetirən kollektiv, işçilər dəstəsi. *Çilingərlər briqadası.* – *Salman kişi axşam tikintiyə qayıdanda briqada üzvlərini orada gördü.* Mir Cəlal.

**BRİQADÍR** [*alm.*] 1. Briqada rəhbəri, başçı (b a x **briqada** 3-cü mənada). *Ferma briqadiri.*

2. *tar.* Rusiyada XVIII əsrdə polkovnik ilə general arasında hərbi rütbə.

**BRİQADİRLİK** *is.* Briqadir vəzifəsi və işi.

**BRİLYÁNT** [*fr.*] 1. Cilalanmış (taraş edilmiş) almaz, çox baha qiymətli parlaq daş. *Brilyant düzülmüş badamşəkilli cıqqasını yaşıl lentin üstündən taxdı.* M.S.Ordubadi.

2. Brilyantdan qayrılmış, üzərində brilyant qaşlar olan. *Brilyant üzük. Brilyant bilərzik.* – [Oğlan:] *Yəni burada, siz buyuran ən əla yekəqaş brilyant üzük .. vardır!* S.Rəhimov.

**BROKER** *is.* [*ing.*] Alıcı və satıcı arasında əlaqə yaradan şəxs.

**BROM** [*yun.*] 1. Qırmızı rəngli maye halında kəskin qoxulu kimyəvi element. [Böyükşor və Masazır] *göllərinin sularında kaustik soda, yod və brom çıxarılması məsələsinin böyük əhəmiyyəti vardır.* M.Qaşqay.

2. *farm.* Tərkibində sinir sistemini sakitləşdirən bromlu birləşmələr olan dərman. *Brom iynəsi.*

**BROMLU** *sif. kim.* Tərkibində brom olan. *Bromlu duzlar. Bromlu su.*

**BRONX** [*yun.*] *anat.* Tənəffüs borusunun ciyərlərə hava aparan şaxələrindən hər biri.

**BRONXİÁL** *sif. anat.* Bronxlara aid olan. *Bronxial astma* (*xəstəlik adı*).

**BRONXÍT** [*yun.*] *tib.* Bronxların selikli qişasının iltihabı (*xəstəlik*).

**BROŞÚRA** [*fr.*] Səhifə sayı az olan kiçik kitab, kitabça, risalə. [Polislər] *şkafdan bir broşüra, iki kitab götürüb, stolun üstünə atdılar.* S.Rəhimov.

**BROVHABROV** *zərf dan.* Dəbdəbə, təntənə, cah-cəlal, dəsgah. *Qoyunlar axşamdan kəsilib, soyutma olub, cahü cəlal ilə, brovhabrov ilə düşürük yola.* Ə.Haqverdiyev.

**BROYLER** *is.* [*ing.*] Ətlik çolpa.

**BU** *iş. əvəz.* 1. Zaman və ya məkan daxilində bilavasitə göz qabağında olan şeyi göstərir, həm də ismə konkretlik verir (*o* müqabili). *O bu evdə yaşayır. Bu kitabı oxudum. Bu şeylər kimindir?* – [Qoca:] *Bilin ki, bu şəhərin hər daşına bir iyidin qanı töküləb.* M.Hüseyn.

2. Qoşa olan iki şeyin birincisini göstərir (*o biri* müqabili). *Çayın bu sahilində. Meydanın bu tərəfində.* – *Qəmər xanım .. astanadan bu taya adladı.* M.İbrahimov. [Ayaz:] *Bu dəfəlik məni yerə vurma, Elman əmi.* Ə.Məmmədxanlı.

3. *İs. mənasında.* Haqqında danışılan, göz qabağında olan hadisə, şey. *Bu mümkün deyil. Bu bizim tanış idi. Bu necə olmuşdu?*

◊ **Bu biri** – başqa, digər. *Atasının səsini eşidib Xalıq bu biri otağa yüyürdü.* S.Rəhimov. **Bununla belə** – baxmayaraq. **Bununla bərabər** – eyni zamanda, yanaşı olaraq.

**BÚBLİK** [*rus.*] Halqa şəklində qoğal.

**BUCAQ** *is.* 1. Bir şeyin iki daxili tərəfinin birləşdiyi yer; künc, guşə. *Dilşad ceyran kimi ürkərək otağın bucağına qısıldı.* M.S.Ordubadi. *Bizdən əvvəl böyük qardaşım yük altında bir bucağa sığınmış quşu qaldırıb: – Tutdum, kəklikdir, – dedi.* A.Şaiq. // *məc.* Ümumiyyətlə, bir yer, sığınacaq, daldalanacaq; guşə, bucaq. *İstərdi fərağətilə bir dəm; Tənha tuta bir bucaqda matəm.* Füzuli. *Hər üfüqdə bir həvəs, hər bucaqda bir umud; İnsanlar daha məsud.* M.Müşfiq. [Ana] *daldalanmaq üçün bir bucaq axtarır.* Ə.Məmmədxanlı. // *məc.* Uzaq bir yer. *16-cı ilin axırlarında bütün ölkə əhalisindəki təlatüm bu uzaq bucaqlara .. da təsirsiz qal-*

*madı.* H.Nəzərli. *Köhnə Azərbaycanın uzaq bir bucağında .. qoca Həsən dayının alçaq koması vardı.* R.Rza.

2. Riyaziyyatda: bir nöqtədən çıxan iki xəttin əmələ gətirdiyi həndəsi fiqur. *Kütbucaq* (90°-dən çox). *Düzbucaq* (90°). *İtibucaq* (90°-dən az). ◊ **Bucaq-bucaq gəzmək** – hər yeri axtarmaq.

**BUCAQLI** *sif.* Bucağı olan.

**BUCAQÖLÇƏN** *is. xüs.* Bucaqları ölçmək üçün cihaz.

**BUCUĞAZ** *əvəz.* "Bu"dan *oxş.* [Qadın:] *Bax, bircə bucuğaz mənim yanımdadır.* M.Hüseyn.

**BUCURQAD** *is. xüs.* Qaldırıcı qurğuların təpəsində və ya intiqal mexanizmlərində: üzərində ip, qayış və s. keçirilən xüsusi formalı çarx. *Quyu qazılacaq yerdə, hündürlüyü 12-15 m olan taxta vışka və bu vışkanın yanlarında qazıma bucurqadını və başqa qazıma alətlərini yerləşdirmək üçün iki talvar tikilirdi.* Quliyev.

**BUD** *is. anat.* Qıçın çanaq sümüyü ilə dizə qədər olan hissəsi. *Bud sümüyü. Bud əti.* – [Çingiz:] *Bir budu şişə çəkib iki çörək ilə tək yemişəm.* Ə.Haqverdiyev.

**BUDAQ** *is.* 1. Ağac və kolların gövdələrindən ayrılan hər bir qol; şaxə. *Payız çağında hər səhər soyuq-soyuq külək əsər; Ağaclara, budaqlara dəyəndə yarpağın tökər.* A.Səhhət. *Budaqları sınan ağacları görərkən .. yolçunun ürəyi sıxıldı.* Ə.Məmmədxanlı. □ **Budaq atmaq (vermək)** – b a x **budaqlanmaq**. *Boylu çinar budaq atmış, qol atmış.* R.Rza.

2. *məc.* Əsas bir şeydən ayrılan qol, şaxə, xətt, şöbə, hissə, qisim.

◊ **Budaq cümlə** *qram.* – tabeli mürəkkəb cümlənin tərkibinə daxil olub, baş (yaxud digər budaq) cümləyə tabe olan cümlə.

**BUDAQCIQ** *is.* Kiçik budaq. *Təzəcə boy atan ağacın budaqcıqları hələ yaşıl rənglərini itirməmişdi.*

**BUDAQÇI** b a x **budayıcı.**

**BUDAQLANMA** "Budaqlanmaq"dan *f.is.*

**BUDAQLANMAQ** *f.* 1. Budaqlara ayrılmaq, şaxələrə ayrılmaq. // Budaqlar əmələ gəlmək, budaq atmaq. *Ağaclar budaqlandı.*

2. *məc.* Şöbələrə, bölmələrə, qollara ayrılmaq. *Kəndin girəcəyində arx budaqlanır.*

**BUDAQLI** *sif.* Budağı olan. *Budaqlı ağac.* – *Sınıq budaqlı ağaclar qurumağa başlamışdı.* Ə.Məmmədxanlı.

**BUDAQSIZ** *sif.* Budağı olmayan, budaqları kəsilmiş (qırılıb tökülmüş).

**BUDAL** *sif. məh.* Qoçaq, igid.

**BUDALA** *sif. məh.* Dəlixasiyyət, ağıldanyüngül.

**BUDALAMAQ** *f.* b a x **budamaq.**

**BUDAMA** 1. "Budamaq"dan *f.is. Budama bitkilərin boy atmasına güclü təsir edir.*

2. *is. məh.* Paya, dəyənək; iri əl ağacı.

**BUDAMAQ** *f.* 1. Ağacın, kolun quru və ya artıq budaqlarını kəsmək, ya qısaltmaq. *Yaz gələndə ağacları budayırlar ki, yaxşı inkişaf etsin.*

2. *məc.* Döymək, vurmaq, əzişdirmək. *Məhlim, bizi sən yaratmısan? – deyə əlinə tüpürüb, çomaqnan ala Mahmudu yıxılanacan budadı.* "Qaçaq Nəbi". *Əgər səni bu məzhəbdə görərlər; Yerbəyer budayıb əzər, ağlarsan.* M.V.Vidadi. // *məc.* Öldürmək, doğramaq, kəsmək. *Qəmzən qılınc çəkib budar da məni; Başın üçün qoyma bu darda məni.* M.P.Vaqif. *Qəza tutdu, qədər məni budadı; Ağlatdı dostları, güldürdü yadı.* Aşıq Ələsgər.

**BUDANMA** "Budanmaq"dan *f.is. Tənəklərin quru budanması da yazda görülən əsas tədbirlərdən biridir.* "Az. qad."

**BUDANMAQ** *məch.* Ağacın, kolun quru və ya artıq budaqları kəsilmək, ya qısaldılmaq.

**BUDATMAQ** *icb.* Budama işi gördürmək.

**BUDAYICI** *is.* Meyvə ağac və kollarının qurumuş budaqlarını kəsən adam. *Manqanın bütün üzvləri budayıcıların seminarlarında iştirak etdilər.*

**BUDDÍST** Budda dininə mənsub olan adam.

**BUDDÍZM** [*xüs. is.*-dən] Eramızdan qabaq VI əsrin axırında Şimali Hindistanda ortaya çıxıb, sonradan Tibetdə, Çində, Hind-Çində və başqa Şərq ölkələrində yayılmış din. *Budda dini*.

**BUDKÁ** [*rus.* будка] Qarovulçu, növbətçi, yaxud bir şey satmaq və s. üçün, adətən taxtadan qayrılan kiçik tikili. *Qəzet budkası. Su budkası. Dəmiryol budkası. – Rüstəm uzaqdan Rza Qəhrəmanini görən kimi başını*

*tərpətdi və heç bir söz deməyib, öz budkasına girdi.* M.İbrahimov. [Yunis] *kiçik pəncərəli budkada oturub, kağız nömrələr sayan bir qadından soruşdu.* Mir Cəlal.

◊ **Suflyor budkası** – teatrda səhnənin ön tərəfində suflyor üçün düzəldilmiş yer. *Suflyor öz budkasında oturmadan heç kəs səhnəyə çıxmazdı.* S.Rəhimov.

**BUDKAÇI** *is.* və *sif.* Budkada şey satan, budka satıcısı.

**BÚFER** [*ing.*] *xüs.* Dəmiryol vaqonlarında, avtomobillərdə və s.-də toqquşma zamanı zərbənin, təkanın gücünü azaltmaq üçün yaylı qurğu.

◊ **Bufer dövlət** – ərazisi, bir-biri ilə rəqabət edən böyük dövlətlər arasında olan hərbi və siyasi cəhətdən zəif dövlət.

**BUFÉT** [*fr.*] 1. İçində qab-qacaq, yemək, içki və s. saxlanılan böyük şkaf.

2. Aşxanalarda, restoranlarda və s.-də qəlyanaltı və içki satmaq üçün stol, yaxud piştaxta, həmçinin kiçik aşxana. *Dəmiryol bufeti. Teatr bufeti. – Stansiyanın çirkli bufetində Mirmahmud, Hüseyn və Vəli söhbət edirdilər.* S.Rəhman.

**BUFETÇİ** *is.* 1. Bufetdə (2-ci mənada) xidmət edən işçi.

2. *köhn.* Bufet (2-ci mənada) sahibi.

**BUFETÇİLİK** *is.* 1. Bufetçinin işi, sənəti.

2. *köhn.* Bufet saxlama.

**BUGÜNKÜ** *s.* Bu gün olan, bu gün baş verən. *Bugünkü söz sabahkı sözün körpüsüdür.*

**BUĞ** *is*. Su və ya başqa bir maye bərk qızdırıldığı zaman hasil olan damcı zərrələrindən ibarət qaz, ya duman; buxar. *Qazandan buğ çıxır. – Qara sapılcanın tortalı köpüyündən acı buğ qalxırdı.* S.Rəhimov. // Mayedən, yaxud nəm bir şeydən çıxan dumanabənzər buxar. *Hədsiz səslər birbirinə qarışıb hamamın səqfinə düşmüşdü; hovuzun buğundan içəridəki adamlar kölgə kimi görünürdülər.* Çəmənzəminli. *Quşlar maşın səsinə hürküb, uzaqlara uçurdu. Dağlardan buğ qalxırdı.* Mir Cəlal.

**BUĞA** *is.* Hələ burulmamış və işə qoşulmamış döllük heyvan (qaramal); kələ. *Buğa seçdikdə onun yaxşı cinsdən olması, yaxşı nəsil verməsi və i.a. tələb olunur*.

**BUĞACA** *is.* Kiçik buğa.

**BUĞALANMA** "Buğalanmaq"dan *f.is.*

**BUĞALANMAQ** *f.* Buğa halına gəlmək, böyüyüb buğa olmaq.

**BUĞALIQ** *is*. Döllük üçün saxlanan erkək heyvan (qaramal).

**BUĞDA** *is.* Dənindən ağ un üyüdülən taxıl növü. *Ağ buğda. Sarı buğda. Xırda buğda. Buğda unu*.

**BUĞDABİTİ** *is*. Buğda və başqa taxıllara ziyan verən cücü.

**BUĞDAYI** *sif.* Buğda rəngli, qarayağız, əsmər. *Biri sərtasər ağ, həm siyah telli; Biri buğdayıdır, amma şəkilli.* M.P.Vaqif. *Doğrudan da Xəlilin günəşdə yanmış buğdayı yanaqlarından, tük basmış sərt üzündən uzun müddət vuruşub yorulduğu dərhal sezilirdi.* M.Hüseyn.

**BUĞDAYIBƏNİZ** bax **buğdayı.** *İclası ortaboylu, arıq, qələmqaş, qaragöz, buğdayıbəniz bir adam aparırdı.* P.Makulu.

**BUĞDAYISİFƏT** bax **buğdayı.** *Bunların* [əsirlərin] *içində buğdayısifət, qonur gözlü, uzun kirpikli bir qız vardı.* Çəmənzəminli.

**BUĞLAMA** 1. "Buğlamaq"dan *f.is.*

2. *is. aşp.* Buğda bişirilən ət; bozartma.

**BUĞLAMAQ** *f.* Bir şeyi buğa (buxara) vermək, buğa tutmaq.

**BUĞLANDIRILMA** "Buğlandırılmaq"-dan *f.is.*

**BUĞLANDIRILMAQ** *məch*. Buğ halına salınmaq, buğ çıxarılmaq, buxarlandırılmaq.

**BUĞLANDIRMA** "Buğlandırmaq"dan *f.is.*

**BUĞLANDIRMAQ** *f.* Buğa çevirmək, buğ halına salmaq, buxarlandırmaq.

**BUĞLANMA** "Buğlanmaq"dan *f.is.*

**BUĞLANMAQ** *f.* 1. Buğ olmaq, buğa çevrilmək, buğ halına gəlmək; buxarlanmaq. *Günəşin təsiri ilə yerdəki sular buğlanır.*

2. Buğ vermək, buğ çıxmaq. *Buludlar parçalanır, torpaq buğ verir, otlar baş qaldırır, quşlar civildəşməyə başlayırdı.* M.İbrahimov. *Ramazanla yanaşı oturan qonağın qarşısındakı dolu boşqab buğlanırdı.* M.Hüseyn.

**BUĞLATMA** "Buğlatmaq"dan *f.is.*

**BUĞLATMAQ** *f.* Buğa çevirmək, buğa çevrilməsinə, buğ çıxmasına səbəb olmaq. *Çaydanı buğlatmaq.*

**BUĞUBURMA** bax **bığıburma.** [Məşədi İbad:] *A kişi, vallah, mən nə qədər qoca ol-*

*sam da, min buğuburma cavana dəyərəm...* Ü.Hacıbəyov.

**BUĞUM** *is.* 1. *anat.* Sümüklərin uclarının bir-birinə birləşdiyi yer, oynaq yeri; bənd, məfsəl. *Barmaqların buğumları* // *zool.* Bəzi heyvanların (xərçənglərin, cücülərin və s.) bədənlərinin bölündüyü hissələrdən (bəndlərdən) hər biri.

2. Bir şeyin boğulmuş, sıxılmış yeri, bəndi.

3. Qamış kimi bitkilərin düyünü.

**buğum-buğum** *zərf* Bənd-bənd, kəsik-kəsik. *Qəlbim sərin, ruhum sevinclə dolğun; Bəlkə də uf deməzdim, doğransam buğum-buğum.* R.Rza.

**BUĞUMAYAQLILAR** *is. zool.* Onurğasız heyvanların bədəni və ayaqları buğumlu olan qrupu (xərçənglər, hörümçəklər, cücülər və s.).

**BUĞUMLANMA** "Buğumlanmaq"dan *f.is.*

**BUĞUMLANMAQ** *f.* Buğum-buğum olmaq, bənd-bənd olmaq.

**BUĞUMLU** *sif.* Buğumları, məfsəlləri olan; bənd-bənd.

**BUĞUMLULAR** b a x **buğumayaqlılar.**

**BUĞUR** *is.* 1. Cavan erkək dəvə. *Paça buğurlar, dizi qara nərlər, gözəl arvanalar .. qoyun sürülərinin dalınca gəlirdi.* Ə.Vəliyev.

2. *məc. dan.* Çox iri, yekə, yoğun adam haqqında.

**BUĞURLANMAQ** b a x **buğurlaşmaq.**

**BUĞURLAŞMAQ** *f.* 1. *dan.* Buğur halına çatmaq, yetişmək.

2. *məc.* Sağlamlaşmaq, yekələşmək.

**BUXAQ** *is.* İnsanın çənəsi ilə boğazı arasındakı hissə; çənəaltı. *Ağ nazik əlinlə bir dəstə bağla; Tər buxaq altında düz bənövşəni.* Qurbani. *Kəlağayının altından çıxmış qara tellərin ucları ağ buxaqda ilan kimi qıvrılmışdı.* Çəmənzəminli.

◊ **Buxaq sal(la)maq** – b a x **buxaqlanmaq**.

**BUXAQLANMA** "Buxaqlanmaq"dan *f.is.*

**BUXAQLANMAQ** *f.* Buxaq sallamaq; kökəlmək, ətlənmək.

**BUXÁLTER** [*alm.*] Bir idarə və ya müəssisənin maliyyə işlərini aparan işçi; mühasib. *Baş buxalter. Buxalter köməkçisi.*

**BUXALTÉRİYA** [*alm.*] 1. Hesabdarlıq və uçot işlərinin nəzəriyyə və praktikası; mühasibat.

2. Bir idarə, ya müəssisənin mühasibat şöbəsi.

**BUXALTERLİK** *is.* 1. B a x **buxalteriya** 1-ci mənada. *Buxalterlik kursu.*

2. Buxalter vəzifəsi, işi, peşəsi. *Buxalterlik etmək.*

**BUXAR** *is.* [*ər.*] 1. B a x **buğ.** *Buxar maşını* (buxarın gücü ilə işləyən maşın). – *Oddan çıxar buxar saçıldıqca ab ona.* Füzuli. *Tər damlaları qırmızı dəmirin üstünə tökülüb buxar oldu.* M.S.Ordubadi.

2. Kömür, odun, torf və s.-nin yanmasından əmələ gələn qaz. *Buxar tutmaq* (*dəm tutmaq*).

**BUXARI** *is.* Divar içində hörülmüş ocaq. *Buxarı çırtaçırt yanır, işığı divarların tutqun rəngli naxışlarına, əlvan pərdələrə və xalılara düşürdü.* Çəmənzəminli. *Qoca Firuzun .. zirzəmisində isə yenə də buxarı yanmırdı.* Ə.Məmmədxanlı. *Nə buxarı çatıldayır, nə şam yanır otaqda.* Ə.Cəmil.

**BUXARLAMA** "Buxarlamaq"dan *f.is.*

**BUXARLAMAQ** b a x **buğlamaq.**

**BUXARLANDIRILMA** "Buxarlandırılmaq"dan *f.is.*

**BUXARLANDIRILMAQ** b a x **buğlandırılmaq**.

**BUXARLANDIRMA** "Buxarlandırmaq"-dan *f.is.*

**BUXARLANDIRMAQ** *f.* Buxara çevirmək, buxar halına salmaq; buğlandırmaq.

**BUXARLANMA** "Buxarlanmaq"dan *f.is.*

**BUXARLANMAQ** *f.* Buxar olmaq, buxar halına gəlmək, buğa çevrilmək; buğlanmaq.

**BUXARÖLÇƏN** *is. tex.* Borularda olan buxarın miqdarını ölçən cihaz.

**BUXARPAYLAYAN** *is. tex.* Buxar mühərriki silindrlərində buxarı avtomatik paylaşdıran mexanizm.

**BUXÇA** b a x **boğça**.

**BUXOV** *is.* 1. Otlağa buraxılan atların ayağına vurulan dəmir çidar. // Qandal.

2. *məc.* Maneə, əngəl. ☐ **Buxov vurmaq (olmaq)** – b a x **buxovlamaq** 2-ci mənada. [Şərqli] *öz ayağına buxov, qoluna zəncir vurmaq istəmir.* O.Sarıvəlli.

**BUXOVLAMA** "Buxovlamaq"dan *f.is.*

**BUXOVLAMAQ** *f.* 1. Ayağa buxov vurmaq. *Atları buxovlamaq.* // Qandallamaq.

2. *məc.* Əl-qol açmağa, inkişaf etməyə qoymamaq, mane olmaq, əngəl olmaq, qabağını almaq. [Davud:] *Daha, deyirlər, daşmır. Bəndlər onu* [Kür çayını] *buxovlayıb.* Mir Cəlal.

**BUXOVLANMA** "Buxovlanmaq"dan *f.is.*

**BUXOVLANMAQ** *f.* 1. *məch.* Buxov vurulmaq. *Atlar buxovlanmışdır.* // Qandallanmaq. // *məc.* Əl-ayağı bağlanmaq.

2. *məc.* Dəli olmaq. [Cahangir bəy:] *Əgər bir neçə müddət də ömrüm belə keçsə, arzuma çatmasam, yəqin ki, buxovlanacağam.* N.Vəzirov.

**BUXOVLANMIŞ** *f.sif.* 1. Ayağına buxov vurulmuş. // Qandallanmış.

2. *məc.* Əl-qolu bağlanmış.

**BUXOVLATMA** "Buxovlatmaq"dan *f.is.*

**BUXOVLATMAQ** *icb.* Ayağına buxov vurdurmaq.

**BUXOVLU** *sif.* Ayağında buxov olan, buxovlanmış. // Qandallı, ayağına qandal vurulmuş.

**BÚXTA** *is.* [*alm.*] Dənizdə gəmilərin dura bilməsi üçün münasib olan kiçik körfəz. *Arxada, buxtadakı gəmilərin top atəşi .. düşmənin başına od ələməyə başladı.* Ə.Əbülhəsən.

**BUXUR** *is.* [*ər.*] Yandırıldıqda ətir saçan qatran.

**BUXURDAN** *is.* [*ər.*] *köhn.* İçində buxur yandırılan kiçik qab.

**BUKÉT** *is.* [*fr.*] Gül, çiçək dəstəsi. *Qız, oğlan lalə kimi uzaqlardan seçilir, onlar çiçəklərlə .. maraqlanır, buket tuturlar.* Mir Cəlal. *Səriyyə bülbüllərin nəğməsini dinləyə-dinləyə .. yolun kənarında gül, çiçək toplayır, buket düzəldirdi.* M.Hüseyn.

**BUKİNÍST** *is.* [*fr.*] Az tapılan, yaxud köhnə kitabları alıb-satmaqla məşğul olan kitab mağazası, yaxud adam. *Bukinist mağazası ərəb və fars dillərində çap olunmuş kitabları və əlyazmalarını alır.* (Qəzetlərdən).

**BUKLET** *is.* [*fr.*] Mətn və şəkillərlə müşayiət edilən informasiya materialından ibarət iri formatlı çap məhsulu; şəkilli broşüra.

**BUQƏLƏMUN** *is.* [*ər.*] 1. Mühitə görə öz dərisinin rəngini dəyişdirmək qabiliyyətinə malik olan sürünən heyvan. *Buqələmun* (*xameleon*) *bir kiçik kərtənkələdir. Bu kərtənkələ bir ağacın budağına yapışıb, heç tərpənməyib, onun üstə gələn kiçik həşəratı tutub yeyir.* H.Zərdabi.

2. *məc.* Öz fikrini, görüşünü, münasibətini asanlıqla və tez-tez dəyişən, dondan-dona girən adam haqqında. *Buqələmun kimi rəngdən-rəngə girən qadının bu halları indi mənə bir çox şeyləri xatırladır.* A.Şaiq. *Səlimi .. "bu qorxunc buqələmunlar mühit və həyatı hələ nə qədər zəhərləyəcəkdir!" – deyə düşündü.* M.İbrahimov. *Bu siyasi buqələmunlardan cümhuriyyət miqyasında neçəsi vardı?* Ə.Əbülhəsən.

**BUQƏLƏMUNLUQ** *is.* İkiüzlülük, riyakarlıq, dondan-dona girmə.

**BULAQ** *is.* 1. Yerin altından sızıb çıxan sərin, soyuq su mənbəyi; çeşmə, qaynaq. *Bulaq başdan bulanar.* (Ata. sözü). [Şirvan vilayətinin] *xoş havalı yaylaqları, şirin bulaqları və hər iki tərəfə axan çoxlu çayları vardır.* A.Bakıxanov. [Cahan:] *Camaatın qara su içməkdən hamısının qarnı şişib; çalışıb kəndə bir bulaq gətirmək lazımdır.* Ə.Haqverdiyev. *Kurort şəbəkəsini inkişaf etdirmək üçün mineral bulaqlar, müalicə palçığı yataqları, müalicə nefti və sairə .. olmalıdır.* M.Qaşqay. □ **Bulaq başı** – bulaq üstü, bulaq kənarı, seyrəngah. *Laçın bulaq başına yetişəndə durdu, dörd yanına boylandı.* M.Hüseyn. *Günəşə çatmağa çalışan bu ağacın altı bulaq başı kimi şənlik olurdu.* Mir Cəlal. // *məc.* Şairanə təsvir və təşbehlərdə. *Əldə ayna gözə sürmə çəkəndə; Ala gözün bulağından öpəydim.* M.P.Vaqif. *Sənin sənət bulağından neçə nəsil şərbət içdi.* S.Vurğun.

2. *məc.* Mənbə, qaynaq, qaynayıb daşan şey. *Şərabxanadə baş xum ayağına qoydum; Nə bak düşməyə gər kövsərin bulağı ələ.* S.Ə.Şirvani. *Neftin bulağını, dağları qoru!* R.Rza.

◊ **Bulaq başına (çaya) susuz aparıb, susuz gətirmək** – çox hiyləgər, çoxbilmiş adam haqqında. [Yaqub:] *Möhsün bəy və yaxud Həsən bəy kimi hər bir incinarı bulaq başına susuz aparıb, susuz da gətirərəm.* B.Talıblı. **Göz bulağı** – gözün yaş damcılayan yeri, gözün buruna tərəf olan küncü. *Xanpəri .. sağ əli ilə qaşlarına sığal çəkdi, gözlərinin bulağını sildi.* Ə.Vəliyev.

**BULAQOTU** *is. bot.* Rütubət yerlərdə bitən ot, bitki.

**BULAMA** *is.* 1. "Bulamaq"dan *f.is.*

2. Təzə doğan sağmal heyvanların ilk günlərdə sağılan südü. *Nənəm o şişək qoyun; Yunu bir döşək qoyun; Bulamanı tez yetir; Qırıldı uşaq, qoyun.* (Sayaçı sözü). *Məmmədağanın inəyi də yenicə doğmuşdur. Ləzzətli buləması var, – deyə Tağı əmi tərif etdi.* S.S.Axundov. // Yumurta, süd və şəkərdən hazırlanan yemək. [Mərdəli:] *Bəs bulama necə? Bu ondan deyil! ..Anam yumurta vurub.* Ə.Əbülhəsən.

**BULAMAC** *is.* Süddə bişirilən un sıyığı . *Qışda bulamac, yayda doğramac*. (Ata. sözü).

**BULAMAQ** *f.* 1. Mayenin içinə qaşıq və s. salıb onu qarışdırmaq. *Dovğanı bulamaq. Südü bulamaq.*

2. Sürtüb ləkələmək, bulaşdırmaq, batırmaq. *Üst-başını palçığa bulamaq. Əllərini mürəkkəbə bulamaq.*

3. O tərəf-bu tərəfə tərpətmək, yellətmək. *İt sahibini görüb quyruğunu bulamağa başladı.*

4. Bəzən isimlərə qoşularaq müxtəlif ifadələr düzəldilir; məs.: başını bulamaq, quyruq bulamaq, qılınc bulamaq, dil bulamaq.

◊ **Qana bulamaq** – b a x **qan.**

**BULANDIRICI** *sif.* 1. Bulandıran; bir şeyin saflığını, şəffaflığını, parlaqlığını pozan.

2. Mədəni qarışdıran, qusdurucu.

**BULANDIRILMAQ** *məch.* Bulanıq hala salınmaq.

**BULANDIRMA** "Bulandırmaq"dan *f.is.*

**BULANDIRMAQ** *f.* 1. Duru suya və ya hər hansı bir şəffaf mayeyə başqa bir şey qarışdıraraq, yaxud dibindəki çöküntünü və s.-ni qaldıraraq bulanıq hala salmaq, rəngini pozmaq. *Suyu bulandırmaq. Dərmanı çalxalayıb bulandırmaq. – De görüm bir, neçin suya girdin? Niyə sərçeşməni bulandırdın?* A.Səhhət.

2. Mədəsini qarışdırmaq, qusmaq ehtiyacı doğurmaq.

**BULANIQ** *sif.* Mayelər haqqında: şəffaf, saf, təmiz, bərraq olmayan, şəffaflığını itirmiş (zibillənmək, yaxud başqa bir şey qarışmaq nəticəsində) (*duru* ziddi). *Bulanıq su. Bulanıq benzin. Bulanıq dərman.* – [Nurəddin] *bulanıq su ilə islanmış halda ..* [çaydan] *kənara çıxdı.* S.S.Axundov. *Bulanıq lehməli sudan camaatın yaxası qurtaracaq, bütün evlər ağac, gül və yaşıllıq içində itəcəkdi.* M.İbrahimov. // Tutqun, pozulmuş, buludlu. *Bulanıq hava.* // *məc.* Heç bir şey ifadə etməyən, öz təbii halını itirmiş, aydın olmayan. *Axır Mahmud əmi ağır-ağır başını qaldırıb, daşın dalından müəllimə tərəf çevirərək, bulanıq gözlərini axıtdı..* B.Talıblı. *Gülsənəm qarın içində ayıldı. Bulanıq gözləri ilə hər yana baxdı.* S.Rəhimov. *Əsirlər lagerində bizi qızartdağ saçlı, bulanıq gözlü topal bir alman qarşıladı.* Ə.Məmmədxanlı.

◊ **Bulanıq suda balıq tutmaq** – fürsətdən istifadə etmək, vəziyyətin qeyri-müəyyənliyindən, birinin çətin vəziyyətdə olmasından istifadə edərək məqsədinə çatmağa çalışmaq.

**BULANIQLIQ** *is.* Bulanıq şeyin halı (*duruluq* ziddi).

**BULANLIQ** 1. B a x **bulanıq.** *Bulanlıq çaylar, ümmanlar, tamam yer, göy durulmuşdur.* S.Vurğun.

2. Bulanıq şeyin halı. *Hovuzda səqfin yırtığından düşən işıq suyun bulanlığını güc ilə aşkar edirdi.* Çəmənzəminli.

**BULANMA** "Bulanmaq"dan *f.is.*

**BULANMAQ** *f.* 1. Duruluğunu, saflığını, şəffaflığını, bərraqlığını itirmək. *Arxın suyu bulandı.* // Tutqunlaşmaq. *Mayenin rəngi gah ağarır, gah da bulanırdı.*

2. Bulaşmaq, batmaq, kirlənmək. *Uşağın üst-başı palçığa bulandı. – Yaralı, al-qana boyanmış idim; Yıxılıb torpağa bulanmış idim.* A.Səhhət.

3. Mədəsi qarışmaq, qusmaq ehtiyacı hiss etmək. *Mədəsi bulanmaq. Ürəyi bulanmaq.*

4. *məc.* Pozulmaq, xarablaşmaq, qarışmaq, tutulmaq. – *Axşam yaxınlaşdıqca, Həsən kişinin əhvalı bulanırdı.* M.İbrahimov. // Hava haqqında. *Hava bulandı.* // Coşmaq, həyəcanlanmaq. *Bulandı dəryalar, həm daşdı sular; Qaynaqsız bulaqlar çayə dönübdür.* Qurbani. *Mən ağ günlər şairiyəm; Fəqət yaman bir xəbərdən; Dəniz kimi bulannam mən.* S.Vurğun. // *məc.* Ölgünləşmək, hissiz bir hala gəlmək, tutqunlaşmaq. *Zehni bulanmaq. Gözləri bulanmaq.*

**BULANTI** *is.* 1. Bulanmış şey.

2. Mədənin qarışması nəticəsində əmələ gələn qusma halı.

**BULAŞDIRILMA** "Bulaşdırılmaq"dan *f.is.*

**BULAŞDIRILMAQ** *məch.* Sürtülüb ləkələndirilmək, kirləndirilmək, batırılmaq.

**BULAŞDIRMA** "Bulaşdırmaq"dan *f.is.*

**BULAŞDIRMAQ** *f.* Sürtmək, sürtüb ləkələmək, çirklətmək, batırmaq. *Hisə bulaşdırmaq. Üst-başını mürəkkəbə bulaşdırmaq.*

**BULAŞIQ** *sif.* 1. Bir şeyə bulaşmış, batmış. *Bulaşıq qaşıq.* – [Uşaq] *yayın istisində tərləyə-tərləyə həyəti süpürər, bulaşıq qabları yuyar, gedib ağasının dükanının qabağını süpürər, sulayardı.* H.Sarabski.

2. Zığlı, kirli. *Bulaşıq göz.*

3. Tutqun, aydın olmayan.

**BULAŞIQLI** b a x **bulaşıq.** *Bulaşıqlı səhəngdən bulanıq su tökülər.* (Ata. sözü). [Qızılgül:] *Mən hamıdan yaxşı, yaraşıqlıyam; Sevməliyəm, ətrə bulaşıqlıyam.* A.Səhhət.

**BULAŞIQLIQ** *is.* Bulaşmış şeyin halı.

**BULAŞMA** "Bulaşmaq"dan *f.is.*

**BULAŞMAQ** *f.* 1. Bulanmaq, batmaq; ləkələnmək. *Üz-gözü palçığa bulaşdı. Üstü yağa bulaşdı. – Ayaqdan bulaşan tozu süpürgə ilə təmizləmək mümkündür.* Ə.Haqverdiyev. // Kirlənmək, zığlanmaq. *Gözləri bulaşmaq.*

2. Pozulmaq, qarışmaq, tutulmaq, qaralmaq. *Hava bulaşdı, deyəsən, yağacaq. – Lakin günəşdə etibar görünmürdü: yerdən buğ qalxır, dağların başı dumanlanır, üfüqlər bulaşmağa başlayırdı.* Çəmənzəminli.

3. Qoşulmaq, qarışmaq, əlaqə saxlamaq, ünsiyyət bağlamaq, durub oturmaq. *Bəzi əfsanəçilərlə yarışırsan, deyəsən! Büsbütün müfsidələrlə bulaşırsan, deyəsən!* M.Ə.Sabir.

**BULDÓQ** *is.* [*ing.*] Yekə və kütsifətli, döşü enli, qıçları qısa və ayaqları yoğun çox sərt və güclü it cinsi.

**BULDÓZER** [*ing.*] *tex.* Torpağı kəsmək, çevirib və düzləndirmək üçün traktorun qabağına keçirilən enli bıçaqşəkilli alət (bəzən həmin bıçaq keçirilmiş traktorun özünə buldozer deyilir). *Yayıldıqca səhraya buldozerlərin səsi; İnsanlar üstün gəlir bütün çətinliklərə.* S.Rüstəm.

**BULDOZERÇİ** *is. xüs.* Buldozerdə işləyən fəhlə. *Buldozerçilər briqadası.*

**BULKÁ** [*rus.* булка] Ağ buğda unundan bişirilən kökə. *Şirin bulka. Xaşxaşlı bulka. Kremli bulka. Kişmişli bulka.*

**BULKAÇI** *is.* və *sif.* 1. Bulka bişirən.

2. Bulka satan, çörəkçi. *Bulkaçı dükanı.*

**BULKAÇILIQ** *is.* Bulka bişirmə sənəti.

**BULMA** "Bulmaq"dan *f.is.*

**BULMAQ** *f. köhn.* Tapmaq, əldə etmək. *Sübhi-əzəldə buldu hər kim səninlə vüslət.* Nəsimi. *Əlbəttə, bular bir şami-firqət; Bir sübh səadət ilə vüslət.* Məsihi. *Tapdı düşmən hər tərəf yüz oldu qovğa aşikar; Buldular fürsət təmami, girdilər meydanə, bax.* M.V.Vidadi. *Bir şəhrdəyəm ki, cümlə dəhri; Gəzsən, bulamazsan öylə şəhri.* M.Ə.Sabir. *Gülnar diqqət verdi, mətləbi buldu.* M.S.Ordubadi.

**BULUD**[1] *is.* 1. Səmada toplanan su buxarı yığını. *Ağ buludlar. Qara buludlar. – Gün çıxır, göydə bulud qırmızı rəngə boyanır.* A.Səhhət. *Günəş parça-parça ağarışan buludlar arasından süzüb çıxdıqca, hava daha da istiləşir.* M.Hüseyn.

2. *məc.* Təhlükə, qorxu mənasında (çox vaxt "qara" sözü ilə bərabər). *Ölkənin üstünü qara buludlar almışdı. – Qara buludlar oynaşır, indi nədir əlacımız?* M.Ə.Sabir.

3. *məc.* Əhval pozğunluğu, qəm, kədər, tutqunluq, pərişanlıq, məyusluq simvolu kimi işlənilir. *Ana yurdun hər yerindən kəsiləcək yad ayağı; Açılacaq dərdlilərin bulud almış qaşqabağı.* S.Vurğun. *Qız bulud kimi tutuldu, hirsindən ağladı.* Mir Cəlal.

4. *məc.* Bir şeyin çoxluğunu, kəsifliyini, hərəkət edən kütlə halında olduğunu göstərir. *Bu halda meydanın məğrib səmtindən bulud kimi toz qalxdı.* M.F.Axundzadə.

5. Adətən yerlik halında: **buludlarda** – çox ucalarda. *Anan yerdə deyil, buludlardadır; Ona yetişməyir insanın səsi.* S.Vurğun.

**BULUD**[2] [*rus.* "блюдо" sözündən] *dan.* Böyük boşqab, uzunsov, ya girdə, dayaz iri boşqab. *Süfrəyə qoyulmuş iri buludun içərisindəki plov otağı ətirlə doldurmuşdu.* Ə.Vəliyev.

**BULUD**[3] *is.* Dənizdən çıxarılan və əslində bitkiyəbənzər bir heyvan bədənindən ibarət olan çox elastik, yumşaq və məsaməli bir cisim (silmək, bədəni yumaq və s. üçün işlənir). *Məktəb taxtasını silirlər cında ilə və ya bulud ilə.* C.Məmmədquluzadə.

**BULUDLANMA** “Buludlanmaq”dan *f.is.*

**BULUDLANMAQ** *f.* Buludla örtülmək, bulud gəlmək. *Göy üzü buludlandı. – Gün əyilirdi, hava buludlanırdı.* Ə.Əbülhəsən.

**BULUDLU** *sif.* 1. Buludla örtülmüş, buludla qaplanmış; tutqun. *Buludlu hava. – Qatar Sumqayıtdan ötüb sürətini artıranda, buludlu səmada tutqun görünən günəş aşağıya enməkdə idi*. Mir Cəlal.

2. *məc*. Qəmgin, kədərli, tutqun mənasında. [Nəbi kişinin] *buludlu qaş-qabağı birdən ayazıyıb açıldı.* S.Rəhimov.

**BULUDLUQ** 1. *is.* Buludların toplandığı yer, bulud toplanmış yer. *Dağın başı buludluqdur.*

2. Bax **buludlu** 1-ci mənada. *Bərk qaranlıq düşdü. Hava buludluq idi.* M.Hüseyn.

**BULUDLULUQ** *is.* Buludlu olma, tutqunluq, buludlu havanın, göyün halı. *Havanın buludluluğu.*

**BULUDSUZ** *sif.* 1. Tamamilə aydın, təmiz (hava haqqında). *Qartal qanad çalarkən buludsuz çöl üzündə; Bir əsən yelə döndü atım Ceyran düzündə.* Ə.Cəmil.

2. *məc*. Şairanə təşbehlərdə: aydın, saf, ləkəsiz. *Qaşlar üç axşamlıq aydı; Hüsnün haqdan gələn paydı; Buludsuz günəşlə taydı; Qız, sənin ala gözlərin.* Aşıq Bəylər.

**BULUDSUZLUQ** *is.* Aydınlıq, saflıq, təmizlik. *Havanın buludsuzluğu şaxtanın şiddətini artırır.*

**BULUNMAQ** *f.* 1. Tapılmaq. *Bulunur hər dərdə istərsən gülüstanda dəva.* Füzuli. *Dərmansız dərdimə bulunmaz çarə; Müyəssər olmasa visalın, Pəri!* Mirzəhəsən.

2. Olmaq. *Maye halında bulunan şeylərin şəkli olmaz, onu hansı qaba töksən, o qabın şəkli və qalıbında olur.* H.Zərdabi. *Əcəba, bir yeni afətmi yetib, ya nə üçün; Bulunursuz belə bir hali-fəlakətdə bu gün?* M.Ə.Sabir. *Bahadır Yusiflə bir böyük, gözəl bəzənmiş zalda bulundular.* N.Nərimanov.

3. Bəzi sözlərə qoşularaq mürəkkəb feil düzəldir. *Axşamlar* [Məşədi Məmməd] *Səmədin yanına gəlib bir günlük fəaliyyəti haqqında məruzədə bulunardı.* B.Talıblı. *Xalq adından çıxışda bulunan bu adamları Məmmədquluzadə boşboğaz adlandırırdı.* M.Arif.

**BULVÁR** [*fr.*] Gəzmək, istirahət etmək və əylənmək üçün şəhər küçələri arasında və ya dəniz sahili boyunca uzanan geniş xiyaban. *Demirəm bulvara bunlar nə xəyal ilə gəlir.* M.Ə.Sabir. *Səninlə tanış oldum bir gün ilk baharda mən; Sahil boyu uzanmış sevdiyim, bulvarda mən.* S.Rüstəm.

**BUMÁJNİK** [*rus.* бумажник] İçinə pul və ya kağız qoymaq üçün cib qovluğu. *Küçədən bir çocuq yüyürdü evə; Bir bumajnik bulub dedi bu nevə.* M.Ə.Sabir. [Cəlil ağanın] *yadına bumajniki düşdü.* İ.Musabəyov.

**BUMAZÉ** [*fr.*] Bir üzü xovlu, isti pambıq parça; bambaz(ı).

2. Bu parçadan tikilmiş. *Bumaze köynək. – Marat qara bumazedən köynək geymişdi.* M.Hüseyn.

**BUMBULAŞIQ** *sif.* Tamamilə bulaşıq, çox çirkli, kirli. *Sübh yerindən duracaq mal kimi; Ağzı-burnu bumbulaşıq yal kimi.* Ə.Nəzmi.

**BUMBUZ** *sif.* Çox soyuq, buz kimi soyuq, həddindən artıq soyuq. *Bumbuz su. – Küçə bumbuz, rəqs edir Ay donmuş pəncərəmdə.* S.Rüstəm.

**BUMERANQ** *is.* [*ing.*] 1. Avstraliyada yerli əhalinin quş və bəzi heyvanları ovlamaq üçün işlətdikləri elastik ov silahı.

2. *məc.* Əleyhinə çevrilmək; əks-təsir.

**BUNCA** *zərf* Bu qədər, bu dərəcədə. *Oldu sənə feyz bunca hasil; Bu vaqiədən zəmanə qafil.* Füzuli. *Bunca cəfalərin görüb ol binəva könül; Ol bivəfayə gör, gənə ümmidvar olur.* S.Ə.Şirvani. // Bu böyüklükdə, bu ağırlıqda. *Dedilər: Mura bax ki, bunca yükü; Qaldırır bir zəif qüvvə ilə.* M.Ə.Sabir.

**BUNCAĞAZ** *əvəz. dan.* bax **bucuğaz.**

**BUND** [əsli *alm.*] 1897-ci ildə Rusiyanın qərb quberniyalarında yaradılmış Ümumi yəhudi sosial-demokrat ittifaqı – menşevizm istiqamətli xırda burjua millətçi partiyası.

**BUNDÇU** *is.* Bund təşkilatının üzvü; bund tərəfdarı.

**BÚNKER** [*ing.*] 1. Kombaynın içərisində müvəqqəti olaraq dən saxlanılan yeşik şəkilli hissəsi. [Yunis:] *Sənin qurduğun makaralar, mancanaqlar heçə bənddir. Bunkerlərin hərəkət edəndə yaralı kimi sızıldayır*. Mir Cəlal. // Eyni mənada pambıqyığan maşında.

2. Müxtəlif istehsalatlarda, gəmidə və s.-də içərisində səpələnən materialları saxlamaq üçün xüsusi qurğuları olan iri yeşik.

**BUNKERLƏMƏ** "Bunkerləmək"dən *f.is.*

**BUNKERÇİ** *is.* Bunkerə xidmət edən fəhlə.

**BUNKERLƏMƏK** *f.* Bunkerə tökmək; yükləmək (səpələnən materialları).

**BUNT** [*alm.*] Qeyri-mütəşəkkil, özbaşına törəyən üsyan; qiyam. [Abuzər bəy:] *Bu dünyada mənim ən çox zəhləm gedən şey lənətə gəlmiş buntlardır.* M.Hüseyn. // İğtişaş, qarışıqlıq. ◻ **Bunt salmaq** – iğtişaş salmaq, qarışıqlıq salmaq.

**BUR** [*alm.*] Texnikada: torpağı və süxurları tədqiq etmək məqsədi ilə müxtəlif quyular qazmaq üçün işlədilən burğu aləti.

**BURA** *zərf* (bəzən əvəzlik mənasında işlənir). Bu yer. *Buranın meyvələri çox dadlı olur. Buram bərk ağrıyır. Buraları heç görməmişdim. Bura nə gözəldir. Bura haçan gəldiniz?*

**BURACAQ** *is. məh.* 1. Ağacdan meyvə dərmək üçün alət.

2. B a x **burğu**[2]**.**

3. Təndirdə odunu qarışdırmaq üçün kösöv.

**BURADA** *zərf* (bəzən əvəz. mənasında işlənir). Bu yerdə. *Burada heç kəs yoxdur. Getmə, burada qal. Ailə üzvlərinin hamısı burada yaşayır. Ayın axırına qədər buradayam. – Burada bizim köhnə bir dostumuz var. Özü məşhur həkimdir.* M.İbrahimov.

**BURADACA** *zərf* Həmin bu yerdə, lap burada. *O, buradaca qələmi yerə qoydu. Buradaca otur. – Ancaq Vaqif buradaca; Bərk etiraz elədi.* M.Dilbazi.

**BURADAKI** *sif.* 1. Bu yerdə olan, bu yerdə duran. *Buradakı şeylərə toxunma. Buradakı kitabları götür.*

2. Bəzən əvəz. mənasında işlənir – bu yerdə olan, yaşayan, bu yerə xas olan. [Əntiqə] *buradakıların heç birindən mərifətsiz oturmaz, pis oxumazdı.* Mir Cəlal.

**BURADAN** *zərf* (bəzən əvəz. mənasında işlənir). 1. Bu yerdən. *Buradan başlamaq lazımdır. Bu həftənin axırında buradan gedəcəyəm. Buradan üç maşın keçdi. Buradan çaya qədər bir kilometr olar.*

2. Bundan əvvəl deyiləndən; bu səbəbə görə. *Buradan belə bir nəticə çıxır.*

**BURAĞAN** *is.* Buruq-buruq dönərək, bərk qar və ya yağışla qarışıq əsən şiddətli külək; fırtına. *Qarı birdən sovurur göylərə müdhiş burağan.* A.Şaiq.

**BURAXDIRILMAQ** *məch.* Başqasının vasitəsilə buraxılmaq.

**BURAXDIRMA** "Buraxdırmaq"dan *f.is.*

**BURAXDIRMAQ** *icb.* Başqasının vasitəsilə buraxmaq, buraxmağa məcbur etmək.

**BURAXICI** *is. mətb.* Kitabı, qəzeti, məcmuəni və s.-ni son təshihdən sonra çapa buraxan nəşriyyat işçisi.

**BURAXILIŞ** *is.* 1. Buraxmaq işi, buraxma. *Məhsul buraxılışı. İstiqraz buraxılışı. Kitab buraxılışı.*

2. Kursu bitirmiş tələbələr dəstəsi. *Azərbaycan Tibb Universitetinin ikinci buraxılışı. Pedaqoji məktəbin ilk buraxılışı. – Müəllimin fikrinə görə, bünövrəni möhkəm qoymaq, buraxılışı da yararlı etmək lazımdır.* S.Rəhimov.

3. Məktəbi bitirmək münasibəti ilə təşkil edilən, buraxılışla əlaqədar olan (imtahan, müsamirə və s.). *Təntənəli buraxılış müsamirəsindən çıxanda .. Nəriman ədibin sevincini duyur və fərəhlənirdi.* Mir Cəlal.

4. Bir əsərin ayrıca çap olunmuş hissəsi. *Lüğətin birinci buraxılışında "A" hərfi gedəcəkdir.*

**BURAXILMA** "Buraxılmaq"dan *f.is.*

**BURAXILMAQ** "Buraxmaq"dan *məch.* (2, 4, 16, 18, 19, 27 və 28-ci mənalardan başqa).

**BURAXMA** "Buraxmaq"dan *f.is.*

**BURAXMAQ** *f.* 1. Əlini açaraq əlindəki, yaxud əli və s. ilə tutduğu şeyin çıxmasına, düşməsinə, getməsinə imkan vermək, daha tutub saxlamamaq. *İpin ucunu buraxmaq. Quşu əlindən buraxmaq. Tutub buraxmır.* // Əlindən salmaq. [Məryəm] *..başını bir neçə dəfə yellətdi və barmaqları boşalıb kağızı buraxdı.* B.Talıblı.

2. İçərisindən keçirmək, bir şeyin öz içərisindən keçməsinə imkan vermək. *Bu şüşə işığı buraxmır. Pərdə işıq buraxır. Bu kağız mürəkkəbi buraxır.*

3. Bir yerə daxil olmağa, keçməyə icazə vermək, girməsinə, daxil olmasına mane olmamaq. *İçəri buraxmaq. İclasa buraxmaq. Zala hələ heç kəsi buraxmırlar. Sərnişinləri vaqona buraxmaq.* // Sürüb salmaq, otlamasına imkan vermək. *Heyvanları əkinə buraxmaq. Sürünü meşəyə buraxmaq. Keçini bostana buraxmaq.*

4. Yol vermək, imkan vermək, qoymaq, razı olmaq. *Mən heç vaxt sizi yalvarmağa buraxmaram.* M.S.Ordubadi.

5. Üzərinə saldırmaq. *İti canavarın üstünə buraxmaq.*

6. Üstündən keçmək, ötürmək; ixtisar etmək. *Yazarkən mətnin üç xəttini buraxdım. Şerin ikinci bəndini buraxdı. İki sətri buraxıb, üçüncüyə keç.*

7. Üzürlü və üzürsüz olaraq gəlməmək (dərsə, iclasa, məşğələyə və i.a.), ötürmək. *Şagird bu həftə iki dərs buraxmışdır.*

8. Ötürmək, əldən çıxarmaq, istifadə edə bilməmək. *Üçüncü tramvaydı ki, buraxıram. İki avtobusu buraxıb, üçüncüsünə minə bildik. Fürsəti əldən buraxmaq.*

9. Axıtmaq, axıb gəlməsinə, axıb getməsinə, ya axıb çıxmasına imkan vermək. *Arxa su buraxmaq. Vannanın suyunu buraxmaq. Otağa təmiz hava buraxmaq.*

10. Öz daxilindən çıxarmaq, yaymaq. *Qaz buraxmaq. Tüstü buraxmaq. – Qatar Culfa burnundan fitini buraxdı.* M.S.Ordubadi. *Uzaqlarda ağ tüstü buraxa-buraxa* (z) *sürünən dəmir yolu qatarı görünür.* M.Hüseyn.

11. Uçurtmaq, havaya qaldırmaq, atmaq, yollamaq. *Badban buraxmaq. Havaya balon buraxmaq. – Bu halda sarayi-şahidən göyə bir fişəng buraxdılar.* M.F.Axundzadə. // *tex.* Süni peyklər, raketlər haqqında. *Aya raket buraxmaq.*

12. Getməsinə icazə vermək, rüsxət vermək. *Məni buraxın, gedim. Atası onu buraxmadı. Mən onu öz yanımdan buraxa bilmərəm. Uşaqları gəzməyə buraxmaq. Bir həftəlik məzuniyyətə buraxmaq.*

13. Azad etmək, daha saxlamamaq; çıxmasına, getməsinə icazə vermək, imkan vermək. *Əsirləri vətənlərinə buraxmaq. İnəkləri tövlədən buraxmaq. Quşu qəfəsdən buraxmaq.*

14. Vermək, təxsis etmək; sərəncamına, ixtiyarına vermək. *Klub təşkili üçün vəsait buraxmaq. Pul buraxmaq.*

15. Məktəbdə təhsil verib, hazırladıqdan sonra hüquq və ad vermək. *Ali məktəblər ildə minlərlə mütəxəssis buraxır.*

16. Tərk etmək, əl çəkmək, vaz keçmək, boşlamaq, atmaq. *Papirosu buraxmaq. Sənətini buraxmaq. Mən köhnə mənzili buraxdım. Bu fikri burax. – Şam ağacı bildi bu keyfiyyəti; Söylədi: Bəsdir, buraxın söhbəti.* M.Ə.Sabir. *Bir ləhzə buraxmaz məni asudə xəyalım.* A.Səhhət. *Ölüb gedənlərin yasını burax; Anla ki, hər zaman axır bu həyat!* S.Vurğun. // *dan.* Boşamaq, boşanmaq, ayrılmaq, atmaq, tərk etmək. *Arvadını buraxmaq. Ərini buraxmaq.*

17. Başlı-başına qoyub getmək, başsız qoymaq. *İşi buraxmaq.* – [Katib:] *Heyif ki, mən dəftərxananı buraxıb gedə bilmədim.* Ə.Haqverdiyev.

18. Əlaqəni kəsmək, uzaqlaşmaq, əl çəkmək. *İstəsən aləmi gəz qarış-qarış; Xain adamları tez görüb, burax.* S.Vurğun.

19. Nəşr etmək, çap edib yaymaq. *Nəşriyyat bu il çoxlu kitab buraxdı. Qəzet buraxmaq.* // İstiqraz, lotereya, pul və s. haqqında. *Yeni marka buraxmaq.* // Çapa, nəşrə, tamaşaya qoymağa icazə vermək. *Əsəri çapa buraxmaq. Yeni pyesi tamaşaya buraxdılar.*

20. Tapşırmaq, saxlamaq üçün vermək. *Evi kimə buraxıb gəldin? – Çamadanı konduktora buraxıb getdim.* Mir Cəlal.

21. Təxir etmək, sonraya qoymaq, keçirmək. *Mübahisəni sonraya burax.* – [Əbülhəsən bəy:] *Eşq, məhəbbət məktubunu gündüz yazmaq cayiz deyil, ..onu gecə saat birdən sonraya buraxmalısan.* M.S.Ordubadi. *Doğrudan da Əhməd məsələni uzağa buraxmayıb, o saat Nabat xanımın yanına elçi göndərdi.* B.Talıblı.

22. Satmaq üçün vermək, təchiz etmək. *Mağazalara mal buraxmaq.* // Satmaq. *Müştərilərə yeni mallar buraxmaq.*

23. İstehsal etmək. *Fabriklərimiz növbənöv mallar buraxır. Avtomobil zavodları yeni tip maşın buraxır.*

24. Uzatmaq, genəltmək. *Paltarın ətəyini bir qədər buraxmaq lazımdır.*

25. Boşaltmaq, gərginliyini azaltmaq. *İpi bir az buraxmaq.*

26. Qoymaq, rastlaşdırmaq, qarşısına çıxarmaq. *Dünya hadisələri heyrətamiz bir surətdə inkişaf edir, insanları hər gün yeni bir vaqiə qarşısında buraxırdı.* M.İbrahimov.

27. *məc.* Xidmət etmək. *Aşxana gündə iki yüz adam buraxa bilir. Hamam saatda yüz adam buraxır.*

28. Əmr şəklində: **burax** (bir şeydən daşındırmaq üçün işlənir) – baş qoşma, bənd olma, məşğul olma, əl çək, fikir vermə. *Burax, canım, onunla işin olmasın.*

**BURALI** *sif.* Bu yer əhalisindən olan, bu yerli. *O, buralı deyil. Bu kişi buralıdır.*

**BURAYA** *zərf* (bəzən əvəzlik mənasında işlənir). Bu yerə, bu tərəfə. *Buraya gəl. Şeyləri buraya gətir. Mən bir də buraya gələn deyiləm. Buraya bax.*

**BURAZ** *is.* Çox yoğun ip. *Burazla bağlamaq. Gəmi burazı.*

**BURAZLAMA** "Burazlamaq"dan *f.is.*

**BURAZLAMAQ** *f.* Burazla bağlamaq, burazla çəkmək (dartmaq).

**BURAZLANMA** "Burazlanmaq"dan *f.is.*

**BURAZLANMAQ** *məch.* Burazla bağlanmaq.

**BURAZLI** *sif.* Burazı olan, burazla bağlanmış.

**BURBUĞ** *is. məh.* Saxsıdan qayrılmış qədim çalğı aləti.

**BURC**[1] b a x **bürc**[1]**.**

**BURC**[2] *is.* Ağacların hələ açılmamış yarpaq və çiçəyi; tumurcuq, puçur. *Mal-qara .. budaqların burclarını yeyirdi.* S.Rəhimov. *Yolun alt və üst tərəflərinə topa-topa söyüd, tut, qələmə, iydə tingləri və burcu tökülmüşdü.* Ə.Vəliyev.

**BURCLAMAQ** *f. məh.* Puçurlamaq, düymə bağlamaq. *Burclayıb düyməçələnmiş ətirli ağ yaylığı və yaşıl donu ilə özünü bəzəmiş .. ağaclar indi lütləşirdi.* S.Rəhimov.

**BURCUXMA** "Burcuxmaq"dan *f.is.*

**BURCUXMAQ** *f.* Qurdalanmaq, yerindən tərpənmək. *Yəhya Kamal stulda burcuxdu, ağır-ağır danışdı.* Mir Cəlal. *Hər ikisi paltarını soyunub, yerinə girsə də, bir neçə saat burcuxa-burcuxa* (z.) *qalıb yata bilmədilər.* M.Hüseyn.

**BURCUTMA** "Burcutmaq"dan *f.is.*

**BURCUTMAQ** *f. dan.* Bədənin orta hissəsini buran kimi etmək, bədənini sağa-sola oynatmaq (bəzən naz-qəmzə etmək mənasında da işlənilir). *Katibə iri bir boşqabda Əlyarovun səhər yeməyini gətirib, masanın üstünə qoydu, geriyə döndü və naz-qəmzə ilə burcudaraq yenə o biri otağa keçdi.* M.Hüseyn.

**BURDURMA** "Burdurmaq"dan *f.is.*

**BURDURMAQ** "Burmaq"dan *icb.*

**BURĞAC** *is.* Mexanizmi hərəkətə gətirmək üçün qurğu.

**BURĞACLI** *sif.* Mexanizmi burulmaqla hərəkətə gətirilən. *Bir əlində oyuncaq – burğaclı yük maşını, bir əlində açar olan ağbəniz .. oğlan uşağı çəpiş kimi səkidən atılıb qapıya tərəf gəldi.* Mir Cəlal.

**BURĞU**[1] *is.* 1. Müxtəlif dəlici alətlərin adı. *Dülgər burğusu. Dəmirçi burğusu. – Dırnağı Əzrailə çəngəl idi; Bığları bir burğuya timsal idi.* S.Ə.Şirvani.

2. Vinti açmaq, ya bərkitmək üçün alət. // Probkaaçan alət.

**BURĞU**[2] *is. məh.* Tənəkləri və s.-ni bağlamaq üçün nazik söyüd çubuğu.

**BURĞULAMA** "Burğulamaq"dan *f.is.*

**BURĞULAMAQ**[1] *f.* 1. Burğu ilə deşmək.

2. *tex.* Burğu ilə qaykada vint yeri açmaq.

**BURĞULAMAQ**[2] *f. məh.* Burğu ilə bağlamaq (b a x **burğu**[2]).

**BURĞULANMAQ** *məch.* Burğu ilə bağlanmaq.

**BURĞULATMAQ** *icb.* Burğu ilə bağlatmaq.

**BURĞULANMA** "Burğulanmaq"dan *f.is.*

**BURXUDULMA** "Burxudulmaq"dan *f.is.*

**BURXUDULMAQ** *məch.* Burulub zədələnmək, sərpdirilmək, yerindən oynadılmaq (bədən üzvü).

**BURXULMA** "Burxulmaq"dan *f.is.*

**BURXULMAQ** *f.* 1. Burulub zədələnmək, sərpmək, yerindən oynamaq. *Qolu burxulmaq. Ayağı burxulmaq.*

2. Burulmaq. *Bir dəfə at dərin yerə düşəndə, Əmiraslan qəflətən ipi çəkdi, at burxulub Nurəddini üstündən saldı.* S.S.Axundov.

**BURXUNTU** *is.* Burxulmaqdan əmələ gələn zədə; qolda, qıçda və s.-də burxulmuş yer.

**BURXUTMA** "Burxutmaq"dan *f.is.*

**BURXUTMAQ** *f.* Burub zədələmək, sərpdirmək, yerindən oynatmaq (bədənin bir üzvünü). *Qolunu burxutmaq. Ayağını burxutmaq.*

**BURJUÁ** [*fr.*] Burjuaziya sinfinə mənsub adam, burjuaziya sinfi nümayəndəsi. // Burjuaziyaya aid olan, ona xas olan. *Burjua görüşləri.*

**BURJUALAŞMA** "Burjualaşmaq"dan *f.is.*

**BURJUALAŞMAQ** *f.* Burjua halına gəlmək, burjua olmaq.

**BURJUAZÍYA** [*fr.*] Kapitalist cəmiyyətində istehsal alət və vasitələrinin sahibi olan və muzdlu əməyi istismar etməklə izafi dəyər alaraq kapitalist gəliri ilə yaşayan hakim sinif. *Burjuaziya respublikası. Burjuaziya inqilabı. Burjuaziya cəmiyyəti.* ☐ **Xırda burjuaziya** – istehsal vasitələrinə sahib olan, muzdlu əməkdən az istifadə edən, yaxud heç istifadə etməyən xırda mülkiyyətçilər.

**BURJÚY** b a x **burjua.** *Burjuylar bayılmış qadınlarını faytona qoyub qaçmaq istəyirdilər.* M.S.Ordubadi.

**BURLÁK** *is.* [*rus.*] Rusiyada gəmiləri kəndirlə axına əks istiqamətdə çəkən muzdur. *Repinin məşhur "Burlaklar" şəkli. – Keçmişdə burlaklar qum üstündə qayıq çəkərdilər.* Ə.Sadıq.

**BURMA** 1. "Burmaq"dan *f.is.*

2. *sif.* Burulmuş, eşilmiş. *Burma bığ. Burma saç.*

3. *sif.* Burğu şəklində olan, vintəoxşar. *Buynuzu burma təkə oynaqlayır, atılıb-düşürdü.* S.Rəhimov. ☐ **Burma qazma** *tex.* – süxurların, neft quyularının və s.-nin burğu alətlərinin fırlanması yolu ilə qazılması üsulu.

4. *is.* Dərz, ot, çubuq, göyərti və s. bağlamaq üçün burulmuş yaş şivlərdən ibarət sarğı, bağ.

**BURMABIĞ(LI)** *sif.* Uzun və burulmuş bığları olan. *Qüdrət onu* [təyyarəçini] *dərhal tanıdı: Şeydanın qonaqlığında gördüyü ucaboy, qırmızısifət, burmabığ oğlandı.* M.Hüseyn. *Karetdən burmabığlı, çiyni paqonlu bir gənc düşdü.* P.Makulu.

**BURMABUYNUZ** *sif.* Buynuzu buruq, burğu şəklində olan. *Qəhrəman indi meşənin sərinliyində .. burmabuynuz inəyi sığallayıb tumarlayırdı.* S.Rəhimov.

**BURMAC** *is. məh.* Çimdik.

**BURMAQ** *f.* 1. Düz şeyi buruq hala salmaq, qıvrım etmək. *Saçı burmaq.* // Eşmək. *Bığlarını burmaq. İpi burmaq.*

2. Dala qatlayıb çevirmək, qanırmaq. *Qolunu burmaq. – Gədələr Qədim dayının qollarını burdular.* S.Rəhimov.

3. Vintləmək, dolandırıb yerinə geydirmək, açmaq, ya bağlamaq. *Vinti burmaq. Samovarın lüləyini burmaq.*

4. Çimdikləmək, barmağının arasında sıxmaq.

5. *k.t.* Erkək heyvanları axtalamaq. *Toğlunu burmaq.*

6. *dan.* Pozmaq, pəl qatmaq.

**BURNUYELLİ** *sif. dan.* Məğrur, lovğa.

**BUROVUZ** 1. *sif.* və *zərf* Qaytarılmaq şərti ilə alınan, müvəqqəti istifadə üçün alınan. *Burovuz paltar. – Axşamdan bir saat keçdikdə, qonşulardan burovuz alınmış əlvan lampalara neft töküb, şalbanlardan asırdılar.* H.Sarabski. *Beləliklə, burovuz aldığı çəkmələr İsrafil bəydən başqa heç kəsi aldada bilmədi.* Mir Cəlal. [Hüseyn:] *Mən hambaldan burovuz paltar ala bilərəm ki..* S.Rəhman.

2. *is.* Burovuz alınmış şey.

**BURSA** b a x **birja.** ☐ **Əmək bursası** – b a x **əmək birjası** (**"birja"**da). [Murad] *heç bir ittifaqın üzvü deyildi. Əmək bursasında qeyd edilməmişdi.* S.Hüseyn.

**BURSAÇI** b a x **birjaçı.** [Şəbanzadə:] *Biz sənin üçün İstanbul bursaçıları deyilik ki, əcnəbi paralarına qiymət təyin edək.* M.S.Ordubadi.

**BURU** *is.* Sancı, şiddətli qarın ağrısı. *Qarnına buru düşmək.*

**BURUCU** *sif.* və *is.* Toxuculuqda və başqa istehsalatda sapı burmaqla məşğul olan.

**BURUQ**[1] *sif.* 1. Burulmuş. *Buruq ip. Buruq sap.* ☐ **Buruq düşmək** – dolaşmaq, dolaşıq düşmək. **Buruq salmaq** – dolaşdırmaq. // Eşilmiş. *Buruq bığ.*

2. Burma-burma olan. *Qoçun buynuzları buruq olur.* // Qıvrım. *Buruq saç.*

3. *k.t.* Axtalanmış xayası çıxarılmış. *Buruq at. Buruq qoyun. Buruq keçi.*

**buruq-buruq** b a x **buruq**[1] 2-ci mənada. *Buruq-buruq saç. – Araba buruq-buruq toz qaldırır.* Ə.Əbülhəsən.

**BURUQ**[2] *is.* Neft, yaxud mədən suları çıxarmaq üçün xüsusi üsullarla qazılan quyu; neft quyusu. [Əhməd:] *Hanı sənin də buruqların? Zavodların, beşmərtəbə evlərin?* Ə.Haqverdiyev. ☐ **Buruq ustası** – burma üsulu ilə neft quyusu qazıma mütəxəssisi

olan fəhlə. **Kəşfiyyat buruğu** – bir yerdə neft, qaz, yaxud mədən suları olub-olmadığını müəyyən etmək və ya başqa məqsədlər üçün burma üsulu ilə qazılan quyu. // Həmin quyunun üstündə düzəldilən qurğu; qüllə, vışka. *Şəfiqə .. uzaqdan neft buruqlarını görüncə sevinərək Məsuda göstərir.* H.Cavid. *Gün uzaqlarda meşə kimi görünən buruqların arasında gizlənə-gizlənə aşağı enirdi.* S.Rəhman. *Gecə ay nur səpərkən buruqlar meşəsinə; Qulaq verdi ney çalan küləklərin səsinə.* Ə.Cəmil.

**BURUQ³** *is.* Boruda axan mayenin, qazın və s.-nin yolunu açıb bağlamaq üçün qurğu; kran. *Bu zaman Gülpərinin balağı samovarın buruğuna ilişib buruğu* [açır]. H.Sarabski.

**BURUQÇU¹** *is. k.t.* Heyvan burmaqla (axtalamaqla) məşğul olan adam.

**BURUQÇU²** *is. köhn.* Keçmişdə: neft quyusu qazan fəhlə.

**BURULĞAN** *is.* 1. Dərin çayda, ya dənizdə suyun burulduğu yer; girdab.

2. Şiddətli külək, fırtına nəticəsində burum-burum qalxan dalğa, qar, toz; havada fırlanan qar. *Qar burulğanı hərlənir, dar küçələrdə dolanan Gülsənəmi tıncıxdırırdı.* S.Rəhimov.

**BURULĞANLI** *sif.* 1. Burulğanlar olan; fırtınalı, coşqun. *Burulğanlı dəniz.*

2. *xüs.* Burulğan kimi öz oxu ətrafında fırlanan, hərəkət edən. *Maqnit sahəsinin əsas xassələrindən biri də onun burulğanlı olmasıdır.* Kazımzadə.

**BURULMA** "Burulmaq"dan *f.is.*

**BURULMAQ** *f.* 1. Buruq düşmək, buruq hala gəlmək. *Məftil buruldu. İp buruldu.* // Qıvrılmaq, dalğavari, şəkildə getmək, axmaq. *Camaat möhkəm və uca .. bəndin üstünə çıxıb gəzinirdi, ağzı qayıtmış Kürün burula-burula* (z.) *axıb getməyinə tamaşa edirdi.* Mir Cəlal.

2. Burum-burum qalxmaq, burula-burula çıxmaq. *Qüdrət, burula-burula* (z.) *havaya qalxaraq .. gözlərinin qabağında dumanlanan göyümtül papiros tüstüsünü üfürüb dağıtdı.* M.Hüseyn.

3. Gedərkən başqa tərəfə dönmək, çevrilmək, istiqamətini dəyişmək. *Həyət qapısından girən kimi sola burulmaq və .. aşağı enmək lazım gəldi.* M.İbrahimov. [Əjdər] *bu sözlərdən sonra sağa burularaq getdi.* S.Rəhman. [Kompozitor] *küçənin tinini burulanda .. bir adamla qarşılaşdı.* İ.Əfəndiyev.

**BURULMUŞ¹** *f.sif.* 1. Buruq hala gətirilmiş. *Burulmuş məftil.* // Qıvrılmış, eşilmiş. *Burulmuş saç, bığ.*

2. Burulub bərkidilmiş. *Burulmuş kran, vint.*

3. Gedərkən istiqamətini dəyişmiş, başqa tərəfə çevrilmiş. *Sağa burulmuş araba.*

**BURULMUŞ²** *f.sif. k.t.* Axtalanmış, axta edilmiş. *Burulmuş qoç.*

**BURULU¹** *sif.* Buruq, burulmuş, buruq-buruq. [Nadir] *..Zeynəbin zərif yanaqlarına tökülmüş burulu saçlarını yad edirdi.* B.Talıblı.

**BURULU²** *zərf* və *sif.* Əyri, dalğavari, qıvrıla-qıvrıla. *Burulu axan çayın qırağına zil bir qaranlıq çökmüş*(*dü*). S.Rəhimov.

**BURUM** *is.* 1. Burula-burula çıxan (qalxan, hərəkət edən) şarşəkilli kütlə. *Tüstü burumları. Qar burumları.*

2. "Bir" sözü ilə: **bir burum** *məh.* – bir dəfə, bir kərə. *Bir burum qaynamaq.*

**burum-burum** *zərf* Burum (1-ci mənada) halında. *Ərzurumun gədiyinə varanda; Onda gördüm, burum-burum qar gəlir.* Aşıq Kərəm. *Qara və qorxunc tüstü burum-burum göyə dirəkləndi.* Ə.Vəliyev.

**BURUN** *is.* 1. İnsan və heyvanın üzündə iybilmə və tənəffüs orqanı. *Dik burun. Düz burun. Yastı burun. Burun pərdəsi* (burun deşiklərinin arasındakı pərdə).

2. Müxtəlif şeylərin, alətlərin və s.-nin uc tərəfi, irəli çıxan hissəsi. *Çəkmənin burnu. Dəhrənin burnu. Külüngün burnu.* □ **Burun vurmaq** – tənəklərin uclarını kəsmək.

3. *coğr.* Qurunun, dənizin içinə girən dağlıq, qayalıq hissəsi. *Zığ burnu. Ümid burnu. – Bakının cənub tərəfində dənizə doğru uzanan iki burun vardır.* H.Sarabski.

◊ **Burnu qanamamaq** – heç bir zərər görməmək. [Əbülhəsən bəy:] *Müvəffəq olduq, bir nəfərin də burnu qanamadı, yenə də silahları və patronları aparıb .. təhvil verdik.* M.S.Ordubadi. *İnsanların bu mübarizliyi mal-qaranı fəlakətdən xilas etdi. Bir buzo-*

*vun da burnu qanamadı.* R.Rza. **Burnu ovulmaq** – cəzalanmaq. [Müəllimə:] *Hərifin nə burnu ovuldu!* Mir Cəlal. **Burnundan düşmək** – tamamilə oxşamaq, eyni olmaq. **Burnundan gəlmək** – ziyan görmək, zərər çəkmək, xeyrini görməmək, çox pis nəticələnmək. **Burnunu ovmaq** – cəzalandırmaq. [İbrahim xan:] *Kəlbəli qudurub, məni tanımaq istəmir. Onun burnunu ovmaq lazımdır.* Çəmənzəminli. **Burnunu yuxarı tutmaq** – iddialanmaq, lovğa olmaq, təşəxxüs satmaq, başqalarına xor baxmaq. **Burnunun ucu göynəmək** – əldə edilə bilməyən bir şeyi çox arzu etmək, həsrətini çəkmək. **Burnunun ucunda** – lap yaxınlıqda.

**BURUNALTI** *zərf* Anlaşılmaz bir surətdə. [Müdir Əkbərə dedi:] *Burunaltı danışma. De görüm, nəyin çatmır?* Mir Cəlal.

**BURUNCUQ** *kiç.* Kiçik burun, yaxud bir şeyin buruna oxşayan hissəsi, çıxıntısı. *Xoruzgülü toxumçalarının üzəri qırışıqdır və onların yuxarısında düz və ya əyilmiş buruncuq vardır.* Qədirov.

**BURUNDUQ** b a x **buruntaq**.

**BURUNGƏLMƏ** *is.* Qaramalda və atlarda olan bir xəstəlik.

**BURUNLAMA** "Burunlamaq"dan *f.is.*

**BURUNLAMAQ** *f.* 1. Burun ilə eşmək, dağıtmaq, vurmaq. *Öküzlər otu burunlayıb dağıtdı.*

2. *məc.* Təqib etmək, gözümçıxdıya salmaq, gözü götürməmək, sıxışdırmaq. *Qız fındığı öz qiymətindən ucuz satdığı üçün köhnə alverçilər onu burunlamağa başladılar.* M.S.Ordubadi.

**BURUNLAŞMA** "Burunlaşmaq"dan *f.is.*

**BURUNLAŞMAQ** *qarş.* Döyüşmək, vuruşmaq, dalaşmaq, sözləşmək. *Qarı bizdən uzaqlaşdı, bir çoxları ilə burunlaşdı.* M.S.Ordubadi.

**BURUNOTU** *is.* Buruna çəkilən tənbəki tozu. [Qoca] *cibindən bir qutu çıxardıb, bir az burunotu çəkdi.* M.S.Ordubadi. [Püstə] *cibindən burunotu çıxarıb, burunotu çəkir və bir-iki dəfə asqırır.* H.Sarabski.

**BURUNTAQ** *is.* Heyvanların ağzına bağlanan ip və s.

**BURUNTAQLAMA**"Buruntaqlamaq"dan *f.is.*

**BURUNTAQLAMAQ** *f.* Heyvanın ağzına buruntaq taxmaq, buruntaq keçirmək.

**BURUNTAQLANMA** "Buruntaqlanmaq"-dan *f.is.*

**BURUNTAQLANMAQ** *məc.* Ağzına buruntaq taxılmaq.

**BURUNTULUQ** b a x **buruntaq.**

**BURYÁT** *is.* Buryat-Monqol Muxtar Respublikasının əsas əhalisini təşkil edən xalqın adı və bu xalqa mənsub adam.

**BURYATCA** *zərf* Buryat dilində.

**BUSƏ** *is.* [*fars.*] Öpüş. *Can alıb bir busə versən ləblərindən, ey pəri! Sanma kim, Seyyid belə sevdayə eylər etiraz.* S.Ə.Şirvani. [Qacar:] *Deyirlər şirindir busənin dadı; O da kor bəxtimə qismət olmadı.* S.Vurğun. ☐ **Busə etmək** – öpmək. *Cəlil ağa isə Şəfiqəni və uşaqlarını busə edib rahat olmağa getdi.* İ.Musabəyov.

**BUSƏLİK** *is. mus.* Azərbaycan klassik muğamlarından biri. *12 əsas muğam bunlar idi: üşşaq, nəva, busəlik, rast, əraq, isfahan, zirəfşənd, büzürg, zəngulə, rəhavi, hüseyni və hicaz.* Ü.Hacıbəyov.

**BUSTAN** *is.* [*fars.*] *klas.* Çiçək bağçası, çiçəklik, güllük. *Matəmgədə gördü bustanı; Riqqət oduna tutuşdu canı.* Füzuli. *Mənim bağım, baharım, həm gülüm, həm bülbülüm sənsən; Nə lazımdır mənə bağü baharü bustan sənsiz.* S.Ə.Şirvani. *Neçin səndə var daima bir xəzan; Haçan gül açarsan sən, ey bustan?* M.S.Ordubadi.

**BUŞMENLƏR** *cəm.* Cənubi Afrikada yaşayan və vaxtı ilə bütün Cənubi Afrikanın əsas əhalisini təşkil edən qəbilələrin adı.

**BUTA[1]** *is.* 1. Qönçə. *İşlə əlim, butalar; Al-əlvan çiçəklər olsun.* M.Rahim.

2. Parça üzərində badamabənzər xırda naxış, kiçik gül şəkli. *O zərif butaları; Yazmaq olmaz kağızda.* M.Seyidzadə.

**BUTA[2]** *is.* [*fars.*] İçində qızıl, gümüş əritmək üçün odadavamlı materialdan (gildən) qayrılmış qab.

**BUTAFÓR** *is.* [*ital.*] Butaforiyaya baxan teatr işçisi, habelə butafor qayıran usta.

**BUTAFÓRİYA** [*ital.*] 1. Səhnə tamaşası üçün lazım olan şeylər.

2. *məc.* Zahiri bəzək, bərbəzək, saxta cah-calal.

**BUTALI** *sif.* Üstündə buta olan; naxışlı, güllü. *Butalı parça. Butalı dəsmal.* – [Məşədi Heydər] *qolunu çırmalayıb, qırmızı butalı nimçənin ortasında köndələn yıxılan cücənin qızarmış budundan yapışdı.* B.Talıblı. *Qapıdan içəri girən kimi iri və dördkünc bir stol üstündə göy butalı ağ süfrə nəzərə çarpır.* Ə.Vəliyev.

**BUTERBRÓD** *is.* [*alm.*] Üzərinə yağ və s. sürtülmüş, yaxud pendir, kolbasa və s. qoyulmuş çörək. *Xosrovbəyli ilə bufetə çıxdıq, o məni buterbroda, qəhvəyə qonaq elədi.* Mir Cəlal.

**BUTƏ** [*fars.*] bax **buta[2].** [Molla İbrahim Xəlil:] *Molla Həmid, çadırdan tez zərgər kürəsini butəsi ilə, kiçik körük ilə çıxar, gətir!* M.F.Axundzadə.

**BUTULKÁ** [*rus.* бутылка] *dan.* İçinə maye tökmək üçün boğazı dar şüşə. *Sirkə butulkası. Şərab butulkası. Butulka zavodu.* – [İsgəndər:] *Amma o pulları aparıb .. versəydin, sənə iki butulka araq verərlərdi.* C.Məmmədquluzadə. *Ortalıqda yanı üstə aşmış bir neçə dolu butulka vardı.* Ə.Əbülhəsən.

**BUY[1]** *nida.* Heyrət, təəccüb bildirir (bəzən qoşa şəkildə işlənir). [Qəmərbanu:] *Buy, niyə ay Xavər xanım, sənin kimi cavan, göyçək xanıma bu tulanbar yaraşmır.* M.İbrahimov.

**BUY[2]** [*fars.*] *klas.* İy, qoxu. *Bənövşə tək ənbər zülfün buy verir; Hər yuyub səryndə havaya, Zeynəb!* M.P.Vaqif. *İntizar çəkərəm ta ki sübhdəm; Ol badi-səbadən buyun istərəm.* Q.Zakir.

**BUYNUZ** *is.* 1. Bəzi heyvanların başında sümük kimi bərk maddədən ibarət çıxıntı (bəzi cücülərin də başında olur). *Qoç buynuzu. İnək buynuzu. Maral buynuzu.*

2. Buynuzdan qayrılmış, yaxud buynuza oxşayan şey.

◊ **Buynuzu içində** – üzündən fağır görünən, lakin ürəyində kini gizli saxlayan, gizlində iş görən adam haqqında.

**BUYNUZBAŞI** *is. bot.* Zəhərli birillik bitki.

**BUYNUZCUQ** *kiç.* Balaca buynuz. *Quzunun buynuzcuqları görünməyə başlayır.*

**BUYNUZGÜLÜ** *is. bot.* Alaq otlarından birinin adı.

**BUYNUZLALƏ** *is. bot.* Birillik zəhərli ot bitki.

**BUYNUZLAMA** "Buynuzlamaq"dan *f.is.*

**BUYNUZLAMAQ** *f.* 1. Buynuzu ilə vurmaq, buynuzu ilə itələmək. *Camışlar bir-birini buynuzlayırlar.*

2. *məc.* Gözü götürməmək, sığışdırmamaq, birinin əleyhinə getmək; incitmək. *Bu quzilə xüsumətin var imiş; .. Səni buynuzlayıb atası bunun.* S.Ə.Şirvani.

**BUYNUZLAŞMA** "Buynuzlaşmaq"dan *f.is.*

**BUYNUZLAŞMAQ** *qarş.* 1. Bir-birini buynuzla vurmaq. *İnəklər buynuzlaşırlar. Keçilər buynuzlaşırlar.*

2. *məc.* Bir-biri ilə çəkişmək, döyüşmək.

3. Buynuza dönmək, buynuz kimi olmaq; sümükləşmək.

**BUYNUZLU[1]** *sif.* Buynuzu olan. *Buynuzlu heyvanlar.* – *Bir buynuzlu təkə dik qayanın başına çıxıb, dörd ayağı ilə tullanıb, geriyə qayıdıb və yenə də bu sərt qayaya çıxırdı.* S.Rəhimov.

**BUYNUZLU[2]** *is. bot.* Birillik yem bitkisi.

**BUYNUZLULAR** *cəm zool.* Buynuzu olan heyvanlar növü. *İnək buynuzlulardandır.*

**BUYNUZSUZ** *sif.* Buynuzu olmayan. *Buynuzsuz keçi, inək.* – *Buynuzsuz qoçun qisasını buynuzlu qoçda qoymazlar.* (Ata. sözü).

**BUYNUZŞƏKİLLİ** bax **buynuzvari**.

**BUYNUZVARİ** *sif.* Görünüşcə buynuza oxşayan, buynuz kimi.

**BUYRUQ** *is.* Əmr, hökm, sərəncam. *Təlaq tamam olduqda, şahın buyruğu ilə onların* [hərəmlərin] *kəbin kağızlarını Xacə Mübarək yırtdı.* M.F.Axundzadə. *Biçarə muzdurun damarları qurudu ki, indicə yaranalın buyruğu ilə Həsənəli bəyin özünü tutub, qazamata göndərəcəkdir.* S.M.Qənizadə. □ **Buyruq qulu** *köhn.* – hər bir əmr və hökmü korkorana yerinə yetirməyə hazır olan adam haqqında. [Kəmalüddövlə:] *Beləliklə, biz .. din rəhbərinin buyruq qulu olaraq azadlıq nemətlərindən məhrumuq.* M.F.Axundzadə. **Buyruq vermək** – əmr vermək, sərəncam vermək. [Molla İbrahim Xəlil] ..*Molla Həmid qabağına gələndən sonra, bu növ ilə ona buyruq verir.* M.F.Axundzadə.

**BUYRUQÇU** *is.* 1. Buyruq verən, əmr verən.

2. Xidmətçi, buyruq icra edən işçi. *Sən olmusan keçi qaytaran əl buyruqçusu.* S.Rəhimov.

**BUYRUQLU** *sif.* Buyruq almış, tapşırıq almış; bir əmr və tapşırıq ilə vəzifələnmiş.

**BUYUXMAQ** *f. dan.* 1. Çaşıb qalmaq, özünü itirmək.

2. Soyuqdan üşümək, büzüşüb qalmaq, donub qalmaq.

**BUYURMA** "Buyurmaq"dan *f.is.* [Cahangir ağa:] *Həmişə buyurmada, vurmada, kəsmədə ömür sürmüş..* S.S.Axundov.

**BUYURMAQ** *f.* 1. Əmr etmək, hökm etmək. [Şah] *bir dəqiqədən sonra başın qaldırıb Mirzə Sədrəddinə buyurdu ki: – Xub, mürəxxəssən, get.* M.F.Axundzadə. [İvan bəy:] *Səsini kəs, buyuraram başına yüz tatarı vurarlar.* N.Vəzirov. // Eyni mənada nəzakət və hörmət üçün deyilir. [Novruzqulu:] *Kəbleyi, nə vaxt buyurursunuz şirni içməyə gələk.* H.Sarabski.

2. *köhn.* Söyləmək, demək, təklif etmək (hörmət və nəzakət ibarəsi olub, bəzən zarafat, yaxud kinayə və istehza üçün deyilir). *Nə buyurursunuz?* – [Pirverdi bəy:] *Bir sözü ki, böyüklərim mənə buyurublar, mən gərək ona əməl eləyəm.* C.Məmmədquluzadə. [Səftərqulu:] *Ağlım yoxdur, ağlı haradan tapım, buyur, görək!* N.Vəzirov. [Kazım ağa:] *Yoldaş özü buyurdu ki, dur get evə, qonaqlar gələcək, hazırlıq gördür.* M.S.Ordubadi. [İlyasov:] *Əyləş, Kazım dayı! Ümumi sözü deməyə nə var; buyur gəlsin, eşidirəm.* Mir Cəlal.

3. Getmək, gəlmək (hörmət və nəzakətlə deyilir). *Bu axşam bizə buyurun. Nə vaxt buyuracaqsınız?*

4. *köhn.* Etmək mənasında (hörmət üçün deyilərdi). [Qətibə xanım:] *Əlahəzrət xoş gəlib, səfa gətirib, həqir olan malikanəmizi öz qədəmləri ilə müzəyyən buyurmuşlar.* M.S.Ordubadi.

5. Əmr formasında: **buyur, buyurun** – nəzakətlə dəvət, müraciət, təklif bildirir, yaxud bir şeyi təqdim etdirdikdə deyilir. *Dedim: – İndi ki, deyirsən bir məhəllənin uşağıyıq, xub, xoş gördük, buyur gedək, qonağımız ol!* C.Məmmədquluzadə. *İlyasov masanın üstündəki qəzetləri dəstə ilə Kazımın qabağına qoydu: – Buyur, bax,* [dedi]. Mir Cəlal. [Musa kişi:] *Mənə qonaq gəlmişsiniz, buyurun içəri, gözüm üstə yeriniz var!* M.İbrahimov.

**BUYURTMA** *f.sif.* Xüsusi sifariş üzrə hazırlanmış. *Buyurtma paltar. Buyurtma çəkmə.*

**BUYURTMAQ** *f.* Sifariş etmək, hazırlamağı tapşırmaq.

**BUYURUCU** *sif.* Əmredici, amiranə. *Bu halda Səlim bəy zavod həyatinə daxil olub, buyurucu bir səslə bağırdı.* H.Nəzərli.

**BUYURUQ** b a x **buyruq.**

**BUYURUQÇU** b a x **buyruqçu.**

**BUYURULMAQ** *məch.* Əmr verilmək, tapşırılmaq.

**BUZ** *is.* 1. Donmuş su. *Buz parçaları. Buz təbəqəsi. Qışda sular donub buz olur.* ☐ **Buz bağlamaq (tutmaq)** – buzla örtülmək, donmaq. *Suyun üzü buz bağlayıbdır. – Sevgilim, qış gəlir, şaxta düşəcək; Yenə axar çaylar buz tutacaqdır.* S.Vurğun. *Ətrafda nə varsa donub buz bağlamışdı.* Ə.Məmmədxanlı.

2. Çox soyuq, sərin şey haqqında (çox vaxt "kimi" qoşması ilə). *Əllərin lap buzdur. Buz kimi bulaq suyu. – Buranın yerindən, havasından əlavə, suyu çox içməlidir. Buz kimi ürək sərinlədəndir.* Ə.Haqverdiyev. *Vücuduna yapışan buz kimi soyuq və kələkötür palçıq onun böyrünü, arxasını deşirdi.* A.Şaiq. ☐ **Buza dönmək** – 1) bərk üşümək, soyuqdan donmaq dərəcəsinə gəlmək; 2) tamamilə soyumaq. *Məşədibəy qayıdıb içəri girəndə, stolun üstündəki xörək soyuyub buza dönmüşdü.* M.Hüseyn.

◊ **Buz baltası** – çox sağlam, canıbərk adam haqqında. **Ürəyi buz kimi olmaq** – tamamilə arxayın, rahat, əmin olmaq.

**BUZÇU** *is.* Buz satan, buz qayıran adam.

**BUZÇULUQ** *is.* Buz qayırma işi, buz saxlama işi.

**BUZDAĞI** *is. coğr.* Buzlu okeanda: buzlardan ibarət olan dağ; aysberq.

**BUZƏ** *is.* [*fars.*] Turşumuş darı xəmirindən hazırlanan içki, kvas.

**BUZXANA** *is.* 1. Buz qayrılan yer.

2. Buz anbarı, buz saxlanılan yer. // Tez xarab olan şeyləri saxlamaq üçün soyuq yer, bina. // Soyuducu cihaz.

**BUZXANAÇI** *is.* 1. Buzxana işçisi.

2. *köhn.* Buzxana sahibi.

**BUZQIRAN** *f.sif. xüs.* Buzları qırmaq üçün olan. ☐ **Buzqıran gəmi** – buzları parçala-

yan, buzları yarıb yol açan, buzlar içində üzmək üçün təchiz edilmiş güclü gəmi. *Gələn həftə gəmi tərsanəsində .. bu cür .. buzqıran gəminin qayrılmasına başlanacaqdır.* (Qəzetlərdən).

**BUZLAQ** *is.* 1. Çoxlu buz yığılan yer.

2. *geol.* Dağ təpələrindən dərələrə qədər uzanan buz təbəqəsi, hərəkət edən buz kütləsi. □ **Buzlaq dövrü** *geol.* – yer tarixində: yer səthinin böyük bir hissəsinin buzla örtülmüş olduğu dövr.

**BUZLAMA** "Buzlamaq"dan *f.is.*

**BUZLAMAQ** *f.* 1. Buz halına gəlmək, buz bağlamaq, buzla örtülmək, donmaq.

2. Bərk üşümək, soyuqdan donmaq. *Əlim-ayağım soyuqdan buzlayıb.*

**BUZLANMA** "Buzlanmaq"dan *f.is.*

**BUZLANMAQ** *f.* Üzü buz tutmaq, buz bağlamaq, buzla örtülmək, üstü donmaq. // Buza dönmək, donmaq.

**BUZLANMIŞ** *f.sif.* Buza dönmüş, donmuş. *Fəslin avqust ayı olmasına baxmayaraq, buzlanmış qar parçası dayanıb dururdu.* S.Rəhimov.

**BUZLU** *sif.* 1. Üstü donmuş, buz bağlamış, buzla örtülmüş, yaxud çox buz olan. *Buzlu göl. Buzlu dənizlər.* // *coğr.* Dəniz adlarında: Şimal Buzlu okean.

2. Soyutmaq üçün içinə buz qoyulmuş, yaxud buz içində soyudulmuş. *Buzlu limonad. Buzlu su. Buzlu ət.*

**BUZLUQ** *is.* Çox buz olan, yaxud buz saxlanılan yer.

**BUZOV** *is.* Hələ süddən ayrılmamış inək balası. [Camaat:] *Gədə, nə belə payız buzovu kimi bəyirirsən?* M.S.Ordubadi. [Bünyad] *ağzını açanda o biri otaqda buzov mələdi.* Ə.Əbülhəsən. □ **Yanı buzovlu** – balalı, balası olan. [Bayram:] *Özümün kürd atımı bağışlaram Namaza və bir yanı buzovlu inək də sənə verrəm.* M.F.Axundzadə.

**BUZOVABAXAN** *is. k.t.* Heyvandarlıq fermalarında buzovlara qulluq edən işçi.

**BUZOVÇU** *is.* Buzovotaran çoban. [Sona xanım:] *Gecə yadıma düşdü ki, xalça burada qalıbdır. Yerdən qalxıb gəldim götürəm ki, tezdən sığırçıya, buzovçuya rast gəlib aparmasın.* M.F.Axundzadə. // b a x **buzovabaxan.** *Elmi təcrübə işi ilə sağıcılar, buzovçular, ferma briqadirləri və s. məşğul olurlar.*

**BUZOVÇULUQ** *is.* Buzovçunun işi, məşğələsi.

**BUZOVLAMA** "Buzovlamaq"dan *f.is.*

**BUZOVLAMAQ** *f.* Buzov doğmaq. *Fermanın inəkləri yenicə buzovlamışdı.*

**BUZOVLUQ** *is.* 1. Buzov saxlanan yer.

2. İnəyin balalığı.

**BUZOVOTARAN** *is.* Dana-buzovu otarmaqla məşğul olan naxırçı.

**BÜDCƏ** *is.* [*fr.*] Dövlətin və onun idarə və müəssisələrinin illik gəlir və çıxar cədvəli. *Dövlət büdcəsi. Büdcə ili.* // Bir adamın müəyyən vaxt ərzindəki gəlir və çıxarı. *Cəfər əmi aldığı maaşın azlığına baxmayaraq etdiyi qənaət sayəsində büdcəsini yaxşı saxlaya bilən adamlardan idi.* H.Nəzərli.

**BÜDƏT** b a x **bidət.**

**BÜDRƏK, BÜDRƏGƏN** *sif.* Tez-tez büdrəyən. *Büdrəgən at. Büdrəgən dəvə.*

**BÜDRƏMƏ** "Büdrəmək"dən *f.is.*

**BÜDRƏMƏK** *f.* 1. Yeriyərkən müvazinəti itirmək, yerişi pozulmaq. *Hamı tökülürlər Araza, ortasında Hacı Qaranın atı büdrəyir.* M.F.Axundzadə. *Onlar bərk-bərk bir-birinin əlindən tutur, heyrətdən böyümüş gözləri ilə ayaqlarının altını görmədən, büdrəyərək yeriyirdilər.* M.İbrahimov.

2. *məc.* Yolunu azmaq, sapmaq, yanılmaq. *Büdrəyənin, yıxılanın qolundan tutar; Qoy hamının işi getsin, deyə qabağa.* S.Vurğun.

**BÜĞZ** *is.* [*ər.*] Kin, ədavət, acıq, nifrət. *İki aqil kəs eyləməz dəva; Eyləməz bir-birinə büğz əsla.* S.Ə.Şirvani. *Büğzü ədavət daşını tullayıb; Bir-birinə yar olacaq, yoxsa yox.* C.Cabbarlı.

**BÜXL** *is.* [*ər.*] *köhn.* Paxıllıq, həsəd. [Laçın:] *Cəmilin hərəkətləri olub yalan, büxl, şivə, müftəxorluq.* N.Vəzirov. *Həddən aşıb büxlü həsəd, şərarət; Yoldaş yoldaşına eylər xəyanət.* Q.Zakir. *Fətəli xanın tərəqqisi Qacarın, sairi-əyanın büxlünü artırıb, ona düşmən elədi.* Ə.Haqverdiyev.

**BÜXUR** b a x **buxur.**

**BÜKDƏLƏMƏK** *f. məh.* Bükülmək, qatlanmaq, qatlanmış şəklə salınmaq.

**BÜKDƏRİLMƏK** *məch. məh.* 1. Qatlamaq, bükmək.

2. Bükülmüş bir şeyi təkrar bükmək.
3. İpi iki qat əyirmək.

**BÜKDÜRMƏ** "Bükdürmək"dən *f.is.*

**BÜKDÜRMƏK** *icb.* Bükük hala saldırmaq.

**BÜKƏLƏMƏ** "Bükələmək"dən *f.is.*

**BÜKƏLƏMƏK** *f.* Lülə şəklində bükmək.

**BÜKƏLƏNMƏK** *məch.* Lülə şəklində bükülmək.

**BÜKƏLƏNMİŞ** *f.sif.* Lülə şəklində bükülmüş. *Mən əlimdə bükələnmiş qəzeti verdim.* Mir Cəlal.

**BÜKMƏ** *is.* 1. "Bükmək"dən *f.is.*

2. *məh.* İçərisinə şəkər, qoz, fındıq və ya badam ovuntusu tökülmüş düyü unu riştəsindən hazırlanan şirni.

**BÜKMƏK** *f.* 1. Müəyyən qaydada qatlamaq. *Köynəyi bükmək. Kağızı bükmək. – O biri səkilərdə də usta bükən sayaq çoxluca paltarlar bükmüşdülər və üstlərinə də cürbəcürə papaqlar qoymuşdular.* Çəmənzəminli. // Örtmək. *Qadın sualımın bir müsahibə şəkli aldığını görüncə əlindəki kitabı bükdü.* S.Hüseyn.

2. Sarımaq, bürümək. *Şeyləri kağıza bükmək. – Hədiyyə bir parça çörək götürüb, qəzetə bükdü..* Mir Cəlal. // *Tütünü kağıza qoyub papiros düzəltmək. ..Şamil isə cibindən tütün qutusunu çıxarıb, yoğun bir papiros bükdü.* M.Hüseyn.

3. Əymək. *Nikişin zabitin çiyinlərindən tutub, dala bükdü.* M.İbrahimov. *Yay kimi bükərək ayaqlarını; Qəfildən sıçradın qaranlıqlara.* R.Rza.

4. Qatlayıb tikmək, sırımaq. *Dəsmalın qıraqlarını bükmək.*

◊ **Abrını ətəyinə bükmək** – b a x **abır**. **Belini bükmək** – b a x **bel**. **Boynunu bükmək** – b a x **boyun**. **Büküb-bükmələmək** – yıxmaq, basmaq, əzişdirmək. *Məşədi Əsgər o qədər zorlu idi ki, üç-dörd heylə hambalları büküb-bükmələyib əzişdirə bilərdi.* S.M.Qənizadə.

**BÜKÜCÜ** 1. *sif.* Bükən. *Bükücü maşın.*

2. *is.* Bir şeyi bükməklə məşğul olan işçi.

**BÜKÜK** *sif.* 1. Bükülmüş, qatlanmış. *Bükük bel. Bükük kağız.*

2. *İs. mənasında.* Parça və kağız kimi şeylərin qatlı yerləri. *Parçanı ütüləyib, büküklərini düzəltmək. Kağızı bükükdən kəsmək.*

3. *İs. mənasında.* Bədən üzvlərinin bükülə bilən yerləri. *Qolumun bükükləri soyuqdan sızıldayır.*

**BÜKÜKLÜK** *is.* Bükülmüş, qatlanmış şeyin halı.

**BÜKÜLMƏ** "Bükülmək"dən *f.is.*

**BÜKÜLMƏK** *f.* 1. Qatlanmaq, əyilmək, bükük hala düşmək. *Qəhrəman ..* [Xavərin] *dizlərinin büküldüyünü və qeyri-ixtiyari yerə oturduğunu gördü.* M.İbrahimov. [Tamara:] *Külək əsər, gül bükülər.* S.Vurğun.

2. Əyilmək, ikiqat olmaq, belini əymək. *Beli bükülmək. Boynu bükülmək. – Həcər cəld bükülüb evə girdi.* S.Rəhimov.

3. *məch.* Sarınmaq, bürüdülmək. *Xına bir kağız parçasına bükülmüşdü.* C.Məmmədquluzadə.

4. *məch.* Müəyyən qaydada qatlanmaq. *Kiçik və ipək parçalar bükülüb, güvə dəyməmək üçün tütünə qoyuldu.* M.S.Ordubadi.

**BÜKÜLMƏZ, BÜKÜLMƏYƏN** *sif.* Bükülə bilməyən, qatlanmaz, əyilməz. // *məc.* Sarsılmaz, qüvvətli, möhkəm. [Elxan:] *Bükülməz qollarımı sənin ayaqlarına sərib ürəyimi açıram.* C.Cabbarlı. *Buna şahid, qocalsam da, bükülməyən qamətimdir!* S.Vurğun. *Bükülməyən qolumuzda bu əllərin gücü var.* S.Rüstəm.

**BÜKÜLMÜŞ** *f.sif.* 1. Müəyyən qaydada qatlanmış. *Bükülmüş xalça. Bükülmüş kağız.*

2. Sarınmış. *Torbanı boşaldanda içindən kağıza bükülmüş bir yumru şey çıxdı..* S.S.Axundov. [Gülnazın] *çiyninin üstündən yorğana bükülmüş balaca Almazın gözləri işıldayırdı.* M.İbrahimov.

3. Əyilmiş, qatlanmış. *Bükülmüş bel. Bükülmüş boyun.*

**BÜKÜLÜ** *sif.* 1. Bükülmüş, qatlanmış halda olan. *Bükülü köynək. Bükülü paltar.* // Örtülmüş. *Bükülü kitab.*

2. Bir şeyə sarınmış. *Bükülü qutu. Bükülü şeyləri aç. – Poçtalyon geri qayıdandan sonra İmran Əzizin otağına çıxıb, bükülü kağızı açdı.* Ə.Vəliyev.

3. *İs. mənasında.* Bükülmüş şey. *Sarina bükülünü açıb, Tolstoyun "Sevastopol hekayələri" kitabçasını .. gördü.* Ə.Əbülhəsən. // **"Bir"** sözü ilə: **bir bükülü** – içinə müəyyən miqdarda şey bükülmüş. *Usta Qiyas*

*əlini cibinə salır, bir bükülü pulu onun qabağına qoyur.* M.İbrahimov.

**BÜKÜM** *is.* 1. Paltarın və s.-nin bükük yeri.

2. Bükmə üsulu, tərzi. *Paltarlarının hamısını usta Ağabala topladı, dolma bükümü sayaq bir fitəyə büküb qoydu səkiyə.* Çəmənzəminli.

3. Kağıza və s.-yə bükülmüş şey. *Yunis çamadanı açıb bir büküm çıxardı, kağızı cırıb bükümü uşağa verdi.* Mir Cəlal.

4. **"Bir"** sözü ilə: **bir büküm** – bükülmüş, qatlanmış. *Bir büküm lavaş. Bir büküm halva.*

5. Qırış. [Kərim bəyin] *alnının bükümləri bir neçə dəfə oynadı.* Mir Cəlal.

**BÜKÜŞ** *is.* 1. Bükmə şəkli, bükmə tərzi, bükmə üsulu.

2. Bir şeyin qırışmış, bükülmüş yeri; qırış. *Paltarın büküşü.*

**BÜKÜŞDÜRMƏ** "Büküşdürmək"dən *f.is.*

**BÜKÜŞDÜRMƏK** *f.* Əzib şaxını sındırmaq, bükük-bükük eləmək, qırışdırmaq.

**BÜKÜŞMƏ** "Büküşmək"dən *f.is.*

**BÜKÜŞMƏK** *f.* 1. Əzilib şaxı sınmaq, qırışmaq, büküş-büküş olmaq.

2. Pozulmaq, büzüşmək.

**BÜLBÜL** *is.* [*fars.*] Qaratoyuq fəsiləsindən olan çox gözəl səsli quş. *Bülbülün çəkdiyi dil bəlasıdır.* (Ata. sözü). *Uçur, qonur ağaclara bülbüllər; Əfşan-əfşan durmuş yaşıl sünbüllər.* A.Səhhət. ◻ **Sarı bülbül** – kanarya quşu, bülbüləoxşar oxuyan bir quş. // *məc.* Çox gözəl səsi olan adam haqqında. *Oxu, ey bülbüli-növxani-çəmən! Sənin ilə edəcək fəxr vətən.* M.Hadi.

**BÜLBÜLOTU** *is. bot.* Taxıllar qrupuna mənsub yem bitkisi.

**BÜLƏND** [*fars.*] Uca, yüksək; adətən "asimanə (ərşə və s.) bülənd olmaq" şəklində işlənir – göyə qalxmaq, yüksəlmək, ucalmaq. [İsmayıl bəy:] *Doğrudan, mahalda bədbihesablıq o qədər artıbdır ki, əhalinin naləsi asimanə bülənd olubdur.* N.Vəzirov. *Çalmaq, oynamaq, güləşmək, yallı getmək, ura asimanə bülənd olmuşdu.* C.Məmmədquluzadə. *Səhranın günbatan tərəfindən gördüm bir şölə asimanə bülənd olub, işığı hər yeri, bürüyübdür.* Ə.Haqverdiyev.

**BÜLƏNDPƏRVAZ** *sif.* [*fars.*] *köhn.* 1. Ucadan uçan.

2. *məc.* Alicənab, nəcib, yüksək. *Hər ürək Aslanın mərhəmət, qeyrət və səxavətlə dolu olan ürəyi kimi büləndpərvaz ola bilməz.* C.Cabbarlı.

**BÜLLETÉN** [*fr.*] 1. İctimai əhəmiyyəti olan hadisə haqqında qısa məlumat. *Hava bülleteni.*

2. Bəzi dövri məcmuələrin adı. *Elmlər Akademiyasının bülleteni. Ali Təhsil Nazirliyinin bülleteni.*

3. Seçki vərəqəsi. *Səsvermə bülleteni.* – *Hər bir vətəndaş seçki siyahısında qeyd olunduqdan sonra, seçki bülleteni alır.* (Qəzetlərdən).

4. Xəstənin xəstəlik günlərini göstərən rəsmi vərəqə. [Bənövşə:] *Ona yalandan bülleten verən doktoru məsuliyyətə almaq lazımdır.* S.Rəhman.

**BÜLLUR** *is.* [*ər.* əsli *yun.*] 1. Şəffaf və parlaq daş. ◻ **Dağ bülluru** – optikada və zərgərlikdə işlənən şəffaf rəngli mineral.

2. Xüsusi parlaqlığı və işığı sındırmaq qabiliyyəti olan əla şüşə növü. *Büllur güzgü. Büllur qab. Büllur güldan. Büllur qədəh.* – *Bu gün bir qız gördüm işvəli, nazlı; Büllur pəncərədən baxdı, qayıtdı.* Aşıq Hüseyn Mayil. *Tam süfrənin üzərindən, xas boya və zərlə işlənmiş tavandan büllur bir çilçıraq asılmış, qəndillərinə sarı şamlar düzülmüşdü.* Çəmənzəminli.

3. *sif.* Şəffaf, dumduru, parlaq, təmiz, saf mənasında. *Almadır yanağı, büllur buxağı; Dodaqları meyli, məzəli, güllü.* Aşıq Ələsgər. *Yarpaqlar uclarından sallanan damcıların büllur kimi ətrafa saçdıqları nur içində parıl-parıl yanırdı.* A.Şaiq. *Alagözlü Girdman dilbəri büllur çeşmədən buz kimi soyuq su gətirib, yaralı cəngavərə verdi.* M.Hüseyn.

**BÜLLURİ** *sif.* [*ər.*] Büllur kimi saf, təmiz, ləkəsiz, parlaq. // Şəffaf, dumduru.

**BÜLLURİN** *sif.* [*ər.*] Büllurdan, büllurlu, büllur kimi. *Nə rəva cani-büllurin yetə nazik ləbinə; Bərgi-güldən gərək olsun, gözəlim, cam sənə.* S.Ə.Şirvani.

**BÜLÖV** *is.* Bıçaq və başqa kəsərləri itiləmək üçün daş. [Hacı Nuru:] *Sənin atan usta Rəhman dəllək ülgüc, bülöv ilə məqul dövlət*

*qazandı.* M.F.Axundzadə. [Cəmil] *haradansa bülöv daşı tapıb gətirdi və bıçağının tiyəsini itiləməyə başladı.* M.Hüseyn.

**BÜLÖVLƏMƏ** "Bülövləmək"dən *f.is.*

**BÜLÖVLƏMƏK** *f.* Bülöv daşına çəkib itiləmək. *Bıçağı bülövləmək. Baltanı bülövləmək.*

**BÜLÖVLƏNMƏ** "Bülövlənmək"dən *f.is.*

**BÜLÖVLƏNMƏK** *məch.* Bülöv daşına çəkilib itilənmək.

**BÜLÖVLƏNMİŞ** *f.sif.* 1. Bülövə çəkilib itilənmiş; iti.

2. Bülöv kimi hamarlanmış, cilalanmış, sürüşkən. *Bir az keçincə o yenə də torunu dəstələyib əlinə yığır. Bülövlənmiş çaylaq daşların üzəri ilə .. üzüaşağı burulğanlara tərəf yüyürdü.* S.Rəhimov.

**BÜLÖVLƏTMƏ** "Bülövlətmək"dən *f.is.*

**BÜLÖVLƏTMƏK** *f.* Bülövə çəkdirmək, bülövə çəkdirib itilətmək. *Bıçağı bülövlətmək.*

**BÜLÖVLÜ** *sif.* Bülöv daşına çəkilib itilənmiş, iti.

**BÜLÖVLÜK** *sif.* Bülövə yarar. *Bülövlük daş.*

**BÜLUĞ** [*ər.*] 1. Yetkinlik, yetişmə; həddibüluğa çatma.

2. Oğlan uşağının özünü tanıması.

**BÜNÖVRƏ** *is.* 1. Özül, əsas, təməl. *Evin bünövrəsi möhkəmdir. – Əhmədov maşından düşüb salam verdi. Bünövrələrə sarı yeridi.* Mir Cəlal. // Məc. mənada. [Fərhad:] *..Ey mənim dərdlərimin bünövrəsi, gəl yanımda otur..* Ə.Haqverdiyev. *Lakin o* [Hikmət İsfahani] *bu səltənətin əsaslandığı bünövrənin, ictimai qaydanın pozulmasını qətiyyən istəmirdi.* M.İbrahimov. *Müəllimin fikrinə görə bünövrəni möhkəm qoymaq, buraxılışı da yararlı etmək lazım idi.* S.Rəhimov.

2. Çıx. halda: **bünövrədən** – b a x **binadan** ("bina" sözündə). *Bir hörgü ki, bünövrədən gəc ola; Başı ərşə dəysə, dibi düz olmaz.* Xəstə Qasım.

**BÜNÖVRƏLİ** *sif.* Bünövrəsi, özülü, təməli, əsası olan. *Bünövrəli mülk.* // *məc.* Möhkəm, əsaslı. *İşi bünövrəli gör.*

**BÜNÖVRƏSİZ** *sif.* Bünövrəsi, əsası, özülü, təməli olmayan. *Bünövrəsiz tikintinin davamı olmaz.* // Davamsız, əsassız.

**BÜNYAD** *is.* [*fars.*] Əsas, özül, təməl. ☐ **Bünyad etmək** *köhn.* – əsasını qoymaq, yaratmaq. *Ol qızlar içində bir pərizad; Qeys ilə məhəbbət etdi bünyad.* Füzuli.

**BÜNYƏ** *is.* [*ər.*] Bədənin təbii halı, quruluşu; əsas, kök, bünövrə, özül. *Onun bünyəsi sağlam deyil.*

**BÜRC**[1] *is.* [*ər.*] Qədim şəhər hasarının üzərində müşahidə və müdafiə qülləsi; qala çıxıntısı. *Bakı şəhəri qarşısında, dəniz içərisində indi də görünən bürclərdən, hasarlardan .. məlum olur ki, dörd-beş yüz il bundan əvvəl abad olan yerlər indi su altında qalmışdır.* A.Bakıxanov. *Uzaqdan görürdüm ki, hasarın künclərində, bürclərin dibində əli tüfəngli rus soldatları var-gəl edir.* C.Məmmədquluzadə. *Hava işıqlandıqca Girdman qalasının möhtəşəm bürcləri aydın görünməyə başlayırdı.* M.Hüseyn.

**BÜRC**[2] *is.* [*ər.*] *astr.* Göydə Günəş dairəsinin bölündüyü 12 qisimdən hər biri. *Böyük Ayı bürcü. – Bir bürcdə sabit oldu əxtər; Məhbusi-xəzanə oldu gövhər.* Füzuli. *Səhərin ruzgarı Gülüstana əsdiyi zaman, çəmənlər donunu dəyişir və Həməl bürcündə isə Günəşin qırmızı ələmini qaldırırdılar.* M.S.Ordubadi. // *məc.* Obrazlı təsvirlərdə. *O gün olsun ki, genə məclisə dilbər gəlsin; Çıxıban bürcdən ol mahi-münəvvər gəlsin.* S.Ə.Şirvani.

**BÜRHAN** *is.* [*ər.*] Dəlil, sübut. *Aşiqisadiqləriz, pünhan deyil bürhanımız; Kizbdən varəstə qalmış, şükr olsun, canımız.* M.Hadi.

**BÜRKÜ** *is.* Nəfəs almağı çətinləşdirən isti hava, boğanaq hava. *Dolu çox isti və bürkü olan zamanda nüzul edir.* H.Zərdabi. *Axşam qaranlığı düşdüyünə baxmayaraq, hava hələ bürkü idi.* S.Rəhman.

**BÜRKÜLƏŞMƏ** "Bürküləşmək"dən *f.is.*

**BÜRKÜLƏŞMƏK** *f.* Bürkü olmaq, nəfəs almağı çətinləşdirəcək bir hala gəlmək, boğanaq hala gəlmək (hava).

**BÜRKÜLÜ** *sif.* Boğanaq, nəfəsi çətinləşdirəcək dərəcədə isti. *Bürkülü bağlarda adam istidən boğulurdu.* Mir Cəlal. *Bürkülü iyun günlərinin birini Murad Kür qırağındakı söyüdlükdə, Əziz isə təcrübə tarlasında qarşıladı.* Ə.Vəliyev.

**BÜRKÜLÜK** *is.* Bürkülü hava.

**BÜRQƏ** *is.* [*ər.*] *köhn.* Üz örtüyü, rübənd. *Dilbər, səni tanrı, günəş camalın; At bürqəni, al yanağın görünsün.* Q.Zakir.

**BÜRMƏLƏMƏ** "Bürmələmək"dən *f.is.*

**BÜRMƏLƏMƏK** *f.* Lülə şəklində sarımaq; bir şeylə hər tərəfini bürümək, sarımaq; sarıyıb örtmək; bükmək.

**BÜRMƏLƏNMƏ** "Bürmələnmək"dən *f.is.*

**BÜRMƏLƏNMƏK** *məch.* Lülə şəklində sarınmaq, bir şeylə hər tərəfi bürüdülmək; örtülmək, bükülmək.

**BÜRMƏLƏNMİŞ** *f.sif.* Lülə şəklində sarınmış, bükülmüş.

**BÜRNƏK** b a x **bürüncək**[1].

**BÜRÓ** [*fr.*] 1. Bəzi orqanların, idarələrin, təşkilatların və s.-nin rəhbərlik edici hissəsinin adı. *Qonaqlar gedəndən sonra, İvan Astafoviç büro iclası keçirmişdir.* Mir Cəlal. // Həmin büro heyətinin iclası. *Məsələyə büroda baxılacaq.*

2. Bəzi idarələrin, yaxud onların şöbələrinin, kontorlarının və s.-nin adı. *Arayış bürosu. Hava bürosu. Konstruktor bürosu.*

**BÜROKRÁT** *is.* [*fr.*] Vəzifəsini işin zərərinə, formal yerinə yetirən adam; rəsmiyyətçi.

**BÜROKRATCASINA** b a x **bürokratik.**

**BÜROKRATÍK** *sif.* Bürokratizmə xas olan, bürokratizm mahiyyətində olan. *Bürokratik quruluş.*

**BÜROKRÁTİYA** [*fr.*] 1. Burjua cəmiyyətində: hakimiyyəti əllərində saxlayan istismarçı sinfin imtiyazlı təbəqəsi; idarə başında duran bürokratlar, yüksək rütbəli məmurlar.

2. B a x **bürokratizm.**

**BÜROKRATÍZM** [*fr.*] 1. Yalnız rəsmiyyətə riayət etmək xatirinə olaraq, işin mahiyyətinə laqeydlik göstərmə; süründürməçilik, rəsmiyyətçilik. *Bürokratizm ilə mübarizə. Bürokratizmi aradan qaldırmalı.*

2. Sinifli cəmiyyətdə: dövlət hakimiyyətinin xalq ilə heç bir əlaqəsi olmayan və hakim siniflərin mənafeyini müdafiə edən məmurlar tərəfindən həyata keçirildiyi idarə üsulu.

**BÜROKRATLAŞMA** "Bürokratlaşmaq"-dan *f.is.*

**BÜROKRATLAŞMAQ** *f.* Bürokrat olmaq.

**BÜROKRATLIQ** *is.* Bürokrat adamın keyfiyyəti; rəsmiyyətçilik, süründürməçilik.

**BÜRRAN** *sif.* [*fars.*] *klas.* Kəsən, iti. *Tiğiğəmzən eylə bürrandır ki, cəlladi-əcəl; Töksə qan təcil üçün tiğindən eylər iltimas.* Füzuli. *Baxdıqca revolverinə əndamım olur süst; Bağrım yarılır xəncəri-bürranını görcək.* M.Ə.Sabir.

**BÜRUDƏT** *is.* [*ər.*] *klas.* Soyuqluq, soyuq. *Tifllər şiddəti-bürudətdən; Ağlaşır zar-zar vəhşətdən.* M.Ə.Sabir.

**BÜRUZ** [*ər.*] Ancaq köməkçi feillərlə: **büruz eləmək (etmək)** – b a x **büruzə vermək**. *Sordum dəhanını, dedi dil: sirri-qeybdir; Öz əczini büruz elədi bu cavab ilə.* S.Ə.Şirvani. *Gah-gah, bir para əfradi-bəni-növi-bəşərdən büruz edir.* M.F.Axundzadə; **büruzə çıxarmaq** – b a x **büruzə vermək** 2-ci mənada; **büruzə vermək** – 1) üzə çıxarmaq, aşkara çıxarmaq, göstərmək. *Yenə Mirzə Məmmədəli narazılığını büruzə verib başını bulayır.* C.Məmmədquluzadə. *Lakin Tərlanın səsi titrəyirdi. Böyümüş gözləri içindəki həyəcanı ancaq aydın büruzə verirdi.* M.Hüseyn; 2) aşkara çıxmaq, üzə çıxmaq, özünü göstərmək, görünmək. [Ov itlərinin] *xasiyyətləri ovda büruzə verərdi.* S.S.Axundov; **büruzə verməmək** – üzə verməmək, göstərməmək, aşkara çıxarmamaq. [Şəfiqə] *öz narazılığını büruzə verməmək üçün çölə çıxdı.* Ə.Vəliyev.

**BÜRÜMƏ** "Bürümək"dən *f.is.*

**BÜRÜMƏK** *f.* 1. Hər tərəfini bir şeylə sarımaq, bir şeyə bükmək. *Laçın qəfildən yapıncısını açıb Gülyazı bürüdü.* M.Hüseyn.

2. Gizlətmək, örtmək. *Üzünü bürümək. – Nəğmə kimi pərdə çək xəyalə; Qönçə kimi yüz bürü cəmalə.* Məsihi. *Ay bimürvət, firqətindən məcnunam; Olmuşam divanə, üzün bürümə.* Aşıq Hüseyn. *Mən sənə olmuşam didar aşiqi; Sən üzünü bürüməyin nədəndir?* M.P.Vaqif.

3. Ətrafını almaq, dövrələmək, əhatə etmək, araya almaq, ortalığa almaq, mühasirəyə almaq. *Şəhərin ətrafını atlılar bürüyüblər və hər yandan tərəddüd kəsilib.* C.Məmmədquluzadə. *Bürüyür dövrəmi saysız ulduzlar.* S.Vurğun.

4. Qaplamaq, çulğalamaq, yayılıb tutmaq. *Bir dəqiqə içində bütün evi alov bürüdü. Dağların başını duman bürümüşdür. Sıx buludlar bütün göy üzünü bürümüşdür. Yanğının tüstüsü ətrafı bürümüşdür. – Qeyri-adi bir çiskin hər tərəfi bürümüşdü.* M.İbrahimov. *Yadların onda kəsilsin nəfəsi; Bürüsün hər tərəfi nəğmə səsi.* S.Rüstəm. // Yayılmaq, basmaq, doldurmaq. *Fitələrin üstə xınalanıb yatmış iki kişinin xorultusu hamamı bürümüşdü.* Çəmənzəminli.

5. Hər tərəfini örtmək, bulamaq. *Bürüyüb cümleyi-libasını qan; Eyləyir ahü naləvü əfğan.* S.Ə.Şirvani.

6. Nüfuz etmək, tutmaq, qaplamaq (adətən köməkçi feil kimi isimlərə qoşulur). *Xavəri təlaş bürüdü.* M.İbrahimov. *Nəriman xitabət kürsüsünə çıxanda salonu tamamilə sükut bürüdü.* Mir Cəlal. *Qarını bir həyəcan bürüdü.* Ə.Məmmədxanlı.

**BÜRÜNC** *is.* 1. Mis, sink, qalay xəlitəsindən ibarət metal.

2. Bürüncdən qayrılmış. *Bürünc ləyən. Bürünc məftil. – Bayaq Mirzə Əliməmmədi içəri buraxıb çıxan nökər üstü incə naxışlı bürünc sinidə iki fincan qəhvə gətirdi.* Çəmənzəminli. *Plov gəlməmiş xəlfə mətbəxdən bürünc aftafa-ləyən, gətirib əlsuyu verərdi.* H.Sarabski.

**BÜRÜNCƏK**[1] *is.* Bürünməyə yarayan örtü, üst geyim. *Bu gecə məndən yatdı yoxdu, gərək bir bürüncək götürəm.* C.Məmmədquluzadə. *Müsafirlərin birisi bürüncəyə, o birisi yorğana, bəziləri də palaz və cecimlərə bürünmüşdü.* M.S.Ordubadi. // *məc*. Qiyafə, don, paltar mənasında.

**BÜRÜNCƏK**[2] *is. bot.* Taxıllar qrupuna mənsub birillik ot bitki.

**BÜRÜNCƏKLİ** *sif.* Bürüncək geymiş, üzərinə bürüncək salmış, bir şeyə bürünmüş.

**BÜRÜNDÜRMƏ** "Büründürmək"dən *f.is.*

**BÜRÜNDÜRMƏK** b a x **bürümək** 2-ci mənada. *Ay örtüyü büründürür aləmi; Çulğalayır, geyindirir aləmi.* A.Səhhət.

**BÜRÜNMƏ** *is.* 1. "Bürünmək"dən *f.is.*

2. Qarlı, yağmurlu havalarda üstdən geyilən bürüncək; yapıncı, plaş. *Çoban bürünməsi.*

**BÜRÜNMƏK** *qayıd.* 1. Özünü bir şeylə bürümək; örtünmək. *Şala bürünmək. – Qaydasıdır, qara çarqat bürünür; Siyah, zülfün ucu yerdən sürünür.* Q.Zakir. *Xoş məsəldir bu kim, palasə bürün; Getsə hər yanə el, o yanə sürün.* S.Ə.Şirvani. *Kəblə Fərəculla evin qapı tərəfində, altında döşək .. Ərdəbil kürkünə bürünüb əyləşərək qapının döyülməsini gözləyir.* H.Sarabski.

2. Əhatə olunmaq, dövrələnmək, araya alınmaq. *Ana baxır: izdihamla bürünmüşdür dörd yanı; Milyon-milyon əl uzanıb; Dağıtmaqçın qara mənfur zindanı.* R.Rza.

3. Qaplanmaq, çulğalanmaq, örtülmək. *Qarlı dağlar dumanlara bürünür.* A.Səhhət. // Obrazlı təşbehlərdə. *Qara dəniz gecənin qara donuna bürünüb yatmışdı.* M.S.Ordubadi. *Səhralar al geyib gülə bürünür; Sevinir yurdumun oğulu, qızı.* S.Vurğun. *Qadının üzünü bir acılıq bürüdü.* S.Hüseyn. *Gecə qatı qaranlığa bürünmüşdü.* M.İbrahimov.

**BÜRÜNÜKLÜ** *sif.* Bir şeyə bürünmüş. *Nənəqız yarımsöykəli halda çadrasına bürünüklü* (z) *yatmışdı.* S.Rəhimov.

**BÜRÜŞDÜRMƏ** "Bürüşdürmək"dən *f.is.*

**BÜRÜŞDÜRMƏK** *f.* 1. Bürüşük hala salmaq, bürüş-bürüş etmək, qırışdırmaq, əzişdirmək. *Kağızı, parçanı bürüşdürmək.*

2. B a x **büzüşdürmək.** *Soyuq bizi bürüşdürmüş, kiçiltmişdir.* Mir Cəlal.

**BÜRÜŞDÜRÜCÜ** b a x **büzüşdürücü.**

**BÜRÜŞDÜRÜLMƏK** *məch.* Bürüşük hala salınmaq, bürüş-bürüş edilmək, qırışdırılmaq, əzişdirilmək. *Bütün kağızlar bürüşdürülübdür.*

**BÜRÜŞMƏ** "Bürüşmək"dən *f.is.*

**BÜRÜŞMƏK** *f.* 1. Bürüşük hala düşmək, bürüş-bürüş olmaq, qırış-qırış olmaq. *Üzü bürüşmək. Paltar tamam bürüşmüşdür.*

2. Solmaq, quruyub dağılmaq, təravətini itirmək. *Çiçək bürüşdü. Yarpaqlar bürüşmüşdür. Quraqlıqdan pambığın qozaları bürüşdü.*

**BÜRÜŞMÜŞ** *f.sif.* Bürüşük hala düşmüş, bürüş-bürüş olmuş, qırış-qırış olmuş, qırışmış. *Bürüşmüş kağız. Bürüşmüş pərdə. – Kosa onun* [Meşinovun] *döşündən geriyə itələyərək, bürüşmüş sifətini turşutdu.* S.Rəhimov.

**BÜRÜŞTƏ** *sif.* [*fars.*] Yaxşı bişmiş, kövrək bişmiş, qızarmış. *Bürüştə çörək. Bürüştə qutab. Bürüştə paxlava.* – [Mirzə Qulam:] *Kabab ilə bürüştə lavaşın ayrı ləzzəti olur, axı!* Mir Cəlal.

**BÜRÜŞTƏLİK** *is.* Bürüştə bişmiş şeyin halı; kövrəklik.

**BÜRÜŞÜK** 1. *sif.* Bürüşmüş halda olan; qırışıqlı, qırış-qırış. *Bürüşük üz. Bürüşük köynək.* – [Kərim baba] *bürüşük və titrək əli ilə göyün şimal tərəfindəki kiçik qara buludu göstərərək: – Baxın* [dedi] A.Şaiq. // Əzik. *Nəriman diqqət edəndə saatını, .. bürüşük zərfi tapdı*. Mir Cəlal.

2. *is.* Qırış. *Lampanın işığında onun* [Xanpərinin] *üzündəki bürüşüklər, alnındakı qırışıqlar aydın görünürdü.* Ə.Vəliyev.

**BÜRÜŞÜKLÜK** *is.* Bürüşük şeyin halı. *Üzün bürüşüklüyü qocalığın nişanəsidir.*

**BÜRYAN** *sif.* [*fars.*] Odda qovrulan (qovrulmuş), odda yanan (yanmış). ◻ **Büryan eyləmək (etmək)** – 1) odda yandırmaq, qovurmaq; 2) *məc*. kabab eləmək, yandırmaq. *Ayrılıqdan yar mənim bağrımı büryan eylədi; Özünü bir yana saldı, məni bir yan eylədi.* Nəsimi. *Gər visalından mədəd qılmazsan, ey aram can; Çeşmimi giryan edib bağrımı büryan eyləmə!* Xətayi. *Tutam zülfün üçün dönəm başına; Bağrımı oduna büryan eyləyəm.* M.P.Vaqif. **Büryan olmaq** – 1) odda yanmaq, qovrulmaq; 2) *məc.* kabab olmaq, yanmaq. *Əyyami-visalə yetdi hicran; Vəqt oldu ciyərlər ola büryan.* Füzuli.

**BÜSAT** *is.* [*ər.*] 1. Müəyyən qayda və üsullarla tərtib edilmiş şənlik, məclis, bayram, yaxud təziyə; mərasim. *Qonaqlıq büsatı. Toy büsatı. Matəm büsatı. – Qızlarım, çay büsatını idarə edin, – deyə onlara əmr edincə dördü də samovarın ətrafında toplandı.* M.S.Ordubadi. *Matəm büsatı qurulmuş, ağlaşma başlanmışdı.* A.Şaiq. // Obrazlı təsvir və təşbehlərdə. *Eşq dövranı, mənə tapşırdı Məcnun növbətin; Xali olmaz nəqşi-ərbabi-vəfadən bu büsat*. Füzuli. *Qəm büsatın xətm edibdir dövr Seyyid adına.* S.Ə.Şirvani.

2. *məc.* Təmtəraq, dəbdəbə, dəsgah. [Mirzə Əsgər:] *Bəyim doğru deyir, sizin evin büsatı heç yerdə yoxdur.* N.Vəzirov.

**BÜSATLI** *sif.* Təntənəli, dəbdəbəli, təmtəraqlı.

**BÜSBÜTÜN** *zərf* Tamam, tamamilə. *Büsbütün yorulub gücdən düşmək. Büsbütün əl çəkmək. O büsbütün haqlıdır. – Anaxanımın səbri büsbütün tükəndi.* A.Şaiq. *Ey dan ulduzu! İzdiham çoxalır, qəhrəman şəhər; Büsbütün ayağa qalxmışdır bu gün.* S.Vurğun.

**BÜST** [*fr.*] İnsan bədəninin beldən yuxarı hissəsinin heykəli. *Füzulinin tuncdan tökülmüş büstü. – Fərman bəy Tərlanın yazı stolundan bir qədər irəli qoyulmuş büstə təəccüblə baxdı.* M.Hüseyn.

**BÜT** *is.* [*fars.*] 1. Bütpərəst xalqların ibadət etdikləri heykəl, şəkil və s. // *məc*. Pərəstiş edilən şey. *Mən o zalım yarə bir büt tək pərəstiş eylərəm.* Heyran xanım.

2. Klassik şeirdə: gözələ, dilbərə işarədir; sənəm. *Heyrət, ey büt, surətin gördükdə lal eylər məni.* Füzuli. *Az ləfzilə ol büti-vəfadar; Çox dərdini yarə qıldı izhar.* Məsihi. *Hüsnünə məzhər idik ol büti-siminbədənin.* S.Ə.Şirvani.

**BÜTÇÜ** *is.* və *sif.* Büt qayıran, büt satan. *Yol kənarında bütçü dükanı, qanbur bir ixtiyar əlində böyücük bir büt yonur..* H.Cavid.

**BÜTGƏDƏ** [*fars.*] bax **bütxana**.

**BÜTXANA** *is.* [*fars.*] Bütlərə ibadət olunan ev, bütpərəstlərin ibadətxanası. *Sənəmlər fikri çıxmaz xatirimdən bir zaman, guya; Yazan dəmdə bu viran olmuşu bütxanə yazmışlar.* Q.Zakir. *Bir zaman beyti-xuda dəhrdə bütxanə idi.* S.Ə.Şirvani.

**BÜTÖV** *sif.* 1. Bir küll halında olan; yarım, ya parça halında olmayan; kəsilməmiş, qırılmamış, dağılmamış; yekparə, tam. *Bütöv çörək. Bütöv parça. Bütöv kərpic. Bütöv qarpız.*

2. *Zərf mənasında.* Başdan-başa, bütünlüklə, tamam. *Çayın üzü bütöv buzdur. – Sağ tərəfdə böyük əncir ağacı qonşu tərəfə çıxan divarı bütöv tutmuşdu.* S.Rəhman.

**BÜTÖVLƏNMƏ** "Bütövlənmək"dən *f.is.*

**BÜTÖVLƏNMƏK** *f.* Bütöv olmaq, bütöv hala düşmək.

**BÜTÖVLƏŞDİRİLMƏ** "Bütövləşdirilmək"dən *f.is.*

**BÜTÖVLƏŞDİRİLMƏK** *məch.* Bütöv hala salınmaq.

**BÜTÖVLƏŞDİRMƏ** "Bütövləşdirmək"-dən *f.is.*

**BÜTÖVLƏŞDİRMƏK** *f.* Bütöv hala salmaq.

**BÜTÖVLÜK** *is.* Bir parçadan ibarət olma, bir küll halında olma; bütöv şeyin halı; yekparəlik, tamlıq.

**BÜTPƏRƏST** *is.* [*fars.*] 1. Bütlərə sitayiş edən adam. *Xəzərlər əvvəllərdə bütpərəst idilər.* A.Bakıxanov.

2. *məc.* Allaha inanmayan, kafir mənasında. *Seyyid haman qədimi olan bütpərəstdir; Ey şeyx, inanma Kəbədə gər eyləsə məqam.* S.Ə.Şirvani.

**BÜTPƏRƏSTLİK** *is.* Bütlərə sitayiş. *Dağıstan tayfaları da xəzərlərin istilası və müsəlmanların məhv edilməsi nəticəsində yenə bütpərəstliyə qayıtdılar.* A.Bakıxanov. [Güllücənin] *əhalisi isə .. bütpərəstlikdən qalma adətlər ağuşunda boğularaq, həkimsiz, dərmansız yaşayırdılar.* S.S.Axundov.

**BÜTÜN** 1. *əvəz.* Hamı, hamısı, ümum, cəmi. *Bütün xalq. Bütün aləm. Bütün gecəni işlədim. Bütün qüvvələri topladıq. – Bütün salondakılar dönüb mənə baxdı.* Mir Cəlal. [Salmanova Cumanın] *bütün əməllərini gözünün içinə deyəcəkdi.* Ə.Əbülhəsən.

2. *sif. dan.* Səbatlı, qərarlı, dəyişməz, möhkəm. *Bütün söz. Bütün vəd. Bütün adam* (sözünün üstündə duran adam). *– Aləmdə bu gün əhdi bütün yar ələ girməz; Yandırdı tikan bağrımı, gülzar ələ girməz.* Nəsimi.

3. B a x **bütöv.**

4. *zərf* Tamam, hərtərəfli. *Bütün bədənimi tər basdı.*

5. *zərf* Başdan-başa, başdan-ayağa qədər, tam surətdə. *Bütün kitabı oxudu.*

**bütün-bütün** *zərf* Bütöv parçalarla, bütün halda. *Gilası bütün-bütün udma, çeynə, tumunu çıxart.* Mir Cəlal.

**BÜTÜN-BÜTÜNƏ** *zərf* Bütünlüklə, tamamilə, lap.

**BÜTÜNLƏŞDİRMƏ** "Bütünləşdirmək"-dən *f.is.*

**BÜTÜNLƏŞDİRMƏK** *f.* 1. Bütün hala salmaq.

2. Əskiyini qoyub tamamlamaq.

3. Bir şeyin parçalarını yapışqan və s. ilə yapışdırıb birləşdirmək, bütöv hala gətirmək.

**BÜTÜNLƏŞMƏ** "Bütünləşmək"dən *f.is.*

**BÜTÜNLƏŞMƏK** *f.* Bütün hala düşmək.

**BÜTÜNLÜK** *is.* Bütün şeyin halı, tamamlıq.

**BÜTÜNLÜKLƏ** *zərf* Tamamilə, tamam, hamısı, tam surətdə. *Pambığın yığılması və təmizlənməsi işləri bütünlüklə mexanikləşdiriləcəkdir. – Məhərrəm öz yoldaşını bütünlüklə tanımaq üçün çox vaxt sərf etmədi.* H.Nəzərli.

**BÜVƏ** b a x **böyə.** *Hər daş altında əqrəb qaynadığını, büvə yatdığını, qışda canavar uladığını deyim.* Mir Cəlal.

**BÜZDÜM** *is. anat.* Quyruq sümüyü, onurğanın qurtaracağını təşkil edən sümük. *İnsanın onurğası quyruq fəqərələrindən təşkil olunmuş büzdümlə qurtarır.*

**BÜZMƏ** *is.* 1. "Büzmək"dən *f.is.*

2. Paltarın qırışdırılıb tikilmiş yeri. *Paltarın büzməsi. Çuxanın büzməsi. Tumanın büzməsi.*

3. Büzməli paltar. *Gülsənəm lap arıqlamış, yalınqat, nazik yamaqlı qara büzmənin içində oturmuş və fikrə getmişdi.* S.Rəhimov.

**BÜZMƏK** *f.* 1. Daraltmaq, yığıb sıxmaq, yığmaq. *Kisənin ağzını büzmək.*

2. Paltarın, parçanın və s.-nin bir yerini yığıb tikmək, qatlaya-qatlaya tikib daraltmaq.

◊ **Ağzını büzmək** – b a x **ağız**. **Dodaq büzmək** – b a x **dodaq**.

**BÜZMƏLƏMƏ** "Büzmələmək"dən *f.is.*

**BÜZMƏLƏMƏK** *f.* Büzmə şəklində tikmək, yığmaq, sıxmaq.

**BÜZMƏLƏNMƏK** *məch*. Büzmə halında tikilmək, yığılmaq, sıxılmaq.

**BÜZMƏLİ** *sif.* Büzməsi olan. *Büzməli paltar. Büzməli tuman*. – [Kor kişinin] *əyninə geydiyi ləzgi şalından büzməli çuxası, ayağındakı dikdaban başmağı köhnə bir adam olduğunu bildirirdi.* S.Hüseyn. [Novruzqulu] *büzməli çuxasını əynindən çıxarıb, kətil üstünə qoyduqdan .. sonra .. alış-verişə başlardı.* H.Sarabski.

**BÜZÜCÜ** *sif.* Bir şeyi büzməyə məxsus. *Büzücü maşın.*

**BÜZÜK** *sif.* 1. Büzülmüş, qırışıq. [Yəhya Kamal] *köhnə, büzük, yaraşıqsız paltarına baxdıqca Dilənin taxtın üstündəki məsləhəti qulağında səslənirdi.* Mir Cəlal.

2. Yığılmış, büzülmüş, qıyıq, büzülüb yığılmış, kiçilmiş, dar. [Rüstəmovun] .. *hər şeyə yuxarıdan baxan büzük gözlərində hüdudsuz bir təkəbbür çöküb qalmışdı.* M.İbrahimov.

3. *İs. mənasında*. Büzülmüş yer, qırışıq yer. *Paltarın büzükləri.*

**BÜZÜKLÜK** *is.* Büzük şeyin halı.

**BÜZÜKMƏ** “Büzükmək”dən *f.is.*

**BÜZÜKMƏK** *f.* Büzülmək, büzülüb yığılmaq; özünü büzmək.

**BÜZÜLMƏ** “Büzülmək”dən *f.is.*

**BÜZÜLMƏK** *f.* 1. Yığışmaq, qırışmaq, büzük hala düşmək. [Qızın] *qaşlarının qovuşduğunu, dodaqlarının, büzüldüyünü .. görürdüm.* M.S.Ordubadi.

2. Sığınıb durmaq, yazıq-yazıq durmaq (oturmaq), susmaq, dinməmək. *Ata ümmid ilə baxar uşağa; Büzülübdür anası bir bucağa.* A.Səhhət. *Ayrım qızının belə öyünməsindən, Kərim babanın elə sükut ilə büzülüb durmasından bir qəhqəhə qopdu.* A.Şaiq. // Yığışmaq, öz bədənini yığışdırmaq. *Heyvanlar eyvanın küncündə büzülüb yatan Qəhrəmanı qoxulayır.* S.Rəhimov.

**BÜZÜRG** *is.* [*fars.*] *mus.* Azərbaycan klassik muğamlarından birinin adı.

**BÜZÜŞDÜRMƏ** “Büzüşdürmək”dən *f.is.*

**BÜZÜŞDÜRMƏK** *f.* 1. Büzük-büzük etmək, büzük hala salmaq, qırış-qırış etmək, əzmək. *Köynəyi büzüşdürmək.*

2. Büzüşməsinə səbəb olmaq. *Sabah ertənin soyuğu* [Xosrov və Mədədi] *büzüşdürmüşdü.* S.Rəhimov.

3. Ağzın, dilin selikli qişasını çəkib yığmaq (turş şey haqqında). *Zəy ağzı büzüşdürür. Göyəm ağzımı büzüşdürdü.*

**BÜZÜŞDÜRÜCÜ** *sif.* Ağzın, dilin selikli qişasını yığan, büzüşdürən. *Zəy ağız büzüşdürücü maddədir.*

**BÜZÜŞDÜRÜCÜLÜK** *is.* Büzüşdürücü şeyin xassəsi.

**BÜZÜŞDÜRÜLMƏ** “Büzüşdürülmək”dən *f.is.*

**BÜZÜŞDÜRÜLMƏK** *məch*. Büzük hala salınmaq, qırış-qırış edilmək, əzişdirilmək.

**BÜZÜŞMƏ** “Büzüşmək”dən *f.is.*

**BÜZÜŞMƏK** *f.* 1. Yığılmaq, yığışmaq, bürüşüb kiçilmək, quruyub yığılmaq, solmaq, pəjmürdə olmaq. [Məşədi Kazım ağanın] *kirpikləri bir-birinə qarışıb, bütün vücudu ölüşgəmiş və əndamı quru alma kimi büzüşmüş*(*dü*). M.S.Ordubadi.

2. Ütüsü və hamarlığı pozulub qırış-qırış olmaq (paltar, kağız və s.).

3. Turş bir şeyin təsiri ilə yığılaraq çəkilmək, qamaşmaq. *Göyəmdən ağzım büzüşdü.*

4. B a x **büzülmək** 2-ci mənada. *Yabançı bir adam kimi büzüşüb oturan Qulu furqona bir soyuqluq gətirdi.* M.İbrahimov. *Tapdıq .. büzüşüb qapıya söykəndi.* Ə.Əbülhəsən.

**BÜZÜŞMÜŞ** “Büzüşmək”dən *f.sif. Mahmud əmi müəllimin arxasında durub, qocalıqdan büzüşmüş və qırışlar altında itmiş gözləri ilə hər tərəfə baxırdı.* B.Talıblı.

**BÜZÜŞÜKLÜK** *is.* Büzüşmüş şeyin halı.

# Cc

**C** Azərbaycan əlifbasının üçüncü hərfi. Bax **ce**.

**CABƏCA** *zərf* [*fars.*] Yerbəyer, yerli-yerində, qaydasınca, lazımınca. *İşini cabəca yerinə yetirdi.* – [Ağa Kərim xan:] A*dbaad hər nə ki sizə buyuracağam, o bu gün gərək cabəca əmələ gəlsin.* N.Vəzirov. [Məşədi İbad:] *Allaha şükür, dişlərim hamısı öz yerində cabəca, saqqalım da qapqara şəvə kimi.* Ü.Hacıbəyov. ☐ **Cabəca eləmək** – yerbəyer eləmək. [Seyidlər] *ildə bir dəfə evlərinə qayıdıb, ailələri ilə görüşüb, gətirdikləri pulları cabəca edib, yenə gedirlər qazanc dalınca.* Ə.Haqverdiyev.

**CAD** *is.* Darı unundan bişirilən çörək. [Araz] *içəri atılan kimi bərk şeyin nə olduğunu bilmək üçün onu əli ilə axtarıb, nəhayət, tapdı. Girdə quru cad çörəyi idi.* A.Şaiq. *Safo danışa-danışa xeyli yavaşıdı, əlini uzadıb bir cad götürdü.* S.Rəhimov.

**CADAR** *is. məh.* Bataqlıq yerin quruyandan sonra çox və xırda çatlaması.

**CADAR-CADAR** *sif.* və *zərf* Çatlaq-çatlaq, yarıq-yarıq, hər tərəfi çatlamış. *Ağayev zamanın məhvedici təsirindən pozulmuş, cadar-cadar olmuş divarlara bir də baxdı.* M.Süleymanov. *Ustaların tavanlara, divarlara çəkdikləri suvaq və rəngdən danışmağa dəyməz. Bir ay keçməmiş onların suvağı şoran torpaq kimi cadar-cadar olmuşdu.* "Kirpi".

**CADARLANMA** "Cadarlanmaq"dan *f.is.*

**CADARLANMAQ** *f.* Cadar-cadar olmaq, çatlamaq. *Katibin gözləri qurumuş, dil-dodağı təpimiş və cadarlanmış* (f.sif.) *dodaqlarından qan çırtlayaraq çənəsinə qədər uzanmışdı.* S.Rəhimov. *Susuz torpağın dili cadarlanmışdı.* Ə.Vəliyev.

**CADDƏ** *is.* [*ər.*] İşlək yol, magistral yol. *Gözümə görünən çiçəkləri toplaya-toplaya bir caddə yola çıxdım.* A.Divanbəyoğlu. // *köhn.* Baş küçə, prospekt. *Odanın bir qapısı ilə iki pəncərəsi sağ tərəfdən caddəyə açılır.* H.Cavid.

**CADU** *is.* [*fars.*] 1. Sehr, sehrbazlıq. [Xanpəri:] [Dərvişin] *cadusunda mən bir hikmət görmüşəm ki, əgər istəsə, bu saatda məni qocamdan boşadar.* M.F.Axundzadə. [Xırda xanım:] *Ağa dərviş, deyirlər siz cadu ilə möcüzələr görsədirsiz, doğrudurmu?* N.Vəzirov. *Məmmədsadıq kişi caduya, fala, falçıya inanan deyildi.* B.Bayramov. ☐ **Cadu eləmək, caduya salmaq** – bax **cadulamaq**. [Xala Yunusa:] [Yaqutun anasının] *ağzı qurusun, sənə qarğış edirdi. Deyir, qızımı caduya salıbdır.* Ə.Məmmədxanlı.

2. Obrazlı təşbehlərdə: valehedici, füsunkar mənasında. *Cadu baxışlar. Cadu tellər.* – *Atdı müjgan oxun, keçdi sinəmdən; Cadu qəmzələri canıma düşdü.* Aşıq Ələsgər. *Bir şux qıya baxdı, huş aldı sərdən; O cadu gözlərdə bir cadu gördüm.* Aşıq Dilqəm. *Bir qızım var ki, bu cahan canı; Gözləri məst, qəmzəsi cadu.* S.Ə.Şirvani.

**CADUBAZ** bax **cadugər**.

**CADUBAZLIQ** bax **cadugərlik**. *Genə dualar, genə cadubazlıq meydana gəldi.* N.Nərimanov.

**CADUÇU** bax **cadugər**.

**CADUÇULUQ** bax **cadugərlik**. *Kahinlərin falçılığı, caduçuluğu, cindarlığı və tilsimçilik sənətləri hindulər arasında çox mütədavildir*. F.Ağazadə.

**CADUGƏR** *is.* və *sif.* [*fars.*] Cadugərliklə məşğul olan; sehrbaz, ovsunçu. [Dostəli dərvişə:] *Bu sirdən heç kəs əyan ola bilmir. Hərgah sən cadugərsənsə bu sirri faş et.* Ü.Hacıbəyov. *Çaykovskinin "Sonalar gölü" baletinin ikinci pərdəsində cadugər Rotbardın tilsimi nəticəsində qu quşuna çevrilən gözəl qız Odilliya ilə şahzadə Ziqfridin birgə ifa etdikləri rəqs adajiodur.* Ə.Bədəlbəyli.

**CADUGƏRLİK** *is.* Ovsunçuluq, sehrbazlıq.

**CADUKÜN** *is.* [*fars.*] *köhn*. Bax **cadugər**. *Cadukünsən, tasa bax; Ya bu gün gəl, ya sabah. Ellər şadlıq içində; Biz keçirən yasa bax.* (Bayatı).

**CADULAMA** "Cadulamaq"dan *f.is.*

**CADULAMAQ** *f.* Mövhumata inananların təsəvvürüncə cadu ilə öz təsiri altına almaq; ovsunlamaq.

**CADU-PİTİK** bax **cadu** 1-ci mənada.

**CAĞ** *is.* 1. Çəpər. *Evin qabağına cağ çəkmək.* – *Zeynal bəy dərin bir sükutda bağın sökük cağlarının dibi ilə başını aşağı*

*salıb, yavaş-yavaş getməyə başladı.* Çəmənzəminli.

2. Arabanın yan taxtaları, araba yanı. *Məmmədcəfər arabanın cağından tutub yerə atıldı..* S.Rəhman. *Sonra birdən-birə* [Adilə] *elə amansız bir yorğunluq hiss edib taqətdən düşdü ki, başını geri atıb arabanın cağına söykəndi.* Ə.Məmmədxanlı.

**CAĞILDAMA** "Cağıldamaq"dan *f.is.*

**CAĞILDAMAQ** *f.* Bir-birinə dəyərək və ya ayaq altında qalaraq cağ-cağ səs çıxarmaq (xırda daşlar, tökülən qozlar haqqında).

**CAĞILTI** *is.* Bir-birinə dəyən xırda daşlardan, qozlardan və s.-dən çıxan səs. [Adilə və İlyas] *susmuşdu. Yalnız ayaqları altında sınan quru çör-çöplərin çatırtısı, cığır qırağından qopub aşağı diyirlənən xırdaca daşların cağıltısı eşidilirdi.* Ə.Məmmədxanlı.

**CAĞLAMA** "Cağlamaq"dan *f.is.*

**CAĞLAMAQ** *f.* Çəpər (hasar) çəkmək, çəpərləmək, hasarlamaq.

**CAĞLANMA** "Cağlanmaq"dan *f.is.*

**CAĞLANMAQ** *məch.* Çəpərlənmək, hasarlanmaq.

**CAĞLI** *sif.* Cağ vurulmuş, çəpərli, hasarlı. *Cağlı bağça.*

**CAH** *is.* [*ər.*] *klas.* 1. Mənsəb, məqam, rütbə. *Vəfalı dostumu hər dəm anaram; Ona qurban cahım, cəlalım mənim.* Aşıq Ələsgər.

2. İftixar, fəxr, hörmət. *Sənsən mənim ayım, günüm, hilalım; Dövlətim, iqbalım, cahım, cəlalım.* M.P.Vaqif.

**CAHAN** *is.* [*fars.*] Dünya, aləm, kainat. *Məndə sığar iki cahan, mən bu cahana sığmazam.* Nəsimi. *Çıxdı günəş, doldu cahan nur ilə; Cütçü sürür tarlada cüt şur ilə.* M.Ə.Sabir. ◻ **Cahana gəlmək** – dünyaya gəlmək, doğulmaq. *Xoş gəlibdir xoş saatda cahana; Yox gözəlliyinə qüsur, bəhanə.* Aşıq Ələsgər. *Gələndə Məhəmməd gəldin cahana; Gedəndə, Füzuli getdi, – dedilər.* B.Vahabzadə.

**CAHANDAR** *is.* [*fars.*] *klas.* Cahangir, hökmdar, padşah. *Ərz elədilər ki: "Ey cahandar! Məcnundan olubmusan xəbərdar?"* Füzuli.

**CAHANDARLIQ** *is. klas.* Cahangirlik, hökmdarlıq, padşahlıq. [Yusif şahın] *..əql və fərasətindən, .. cahandarlığından elçi və əmələsi vəcd etdilər.* M.F.Axundzadə. *Bu əsəri "Fərhad və Şirin" sərlövhəsi altında yazmalı idim, lakin Fərhadın sənət və eşqinə dair yazdığım əsərdə siyasət və cahandarlığa dair fikirlərimi inkişaf etdirə bilməzdim.* M.S.Ordubadi.

**CAHANGİR** *is.* [*fars.*] 1. Dünyanı istila edən, dünyanı tutan, ölkələr fəth edən; imperialist. [Elxan:] *Mən üzümə bir din qalxanı çəkib cahangirlərin cəlladlığını qəbul edə bilmərəm.* C.Cabbarlı. *Cahangirlər bir daha güvənməsin özünə; Sarsıdacaq onları həqiqətlərin səsi.* S.Rüstəm. *Keçdi yerin üzərindən qərinələr bir an kimi; Cahangirlər, hökmdarlar xəzəl olub, külə döndü.* N.Rəfibəyli.

2. Çox məşhur, dünyada məşhur, cahanşümul. [Atabəy Qətibəyə:] *..Sənin atan hökmranlıq etdiyi bir məmləkətdə iki cahangir şair bir arıq inəyin südü ilə yaşayır.* M.S.Ordubadi.

**CAHANGİRLİK** *is.* Başqa ölkələri istila etməyə çalışan, bütün dünyanı tutmaq üçün göstərilən meyil və hərəkət; imperializm. *Müstəmləkə və cahangirlik arzusunda olan dövlətlər heç bir vaxt gücsüz xalqa rəhm etməyəcəklər, onun torpaqlarını zəbt edib özünü əsarət altına alacaqlar.* M.İbrahimov.

**CAHANŞÜMUL** *sif.* [*fars.* cahan və *ər.* şümul – şamil olan] Bütün dünya üçün əhəmiyyəti olan, dünyanı tutan, dünyaya yayılan, böyük tarixi əhəmiyyəti olan, dünyada tanınan. *Azərbaycan ədəbiyyatı XII əsrdə Nizami və Xaqani kimi cahanşümul şair yetirmişdir.* M.İbrahimov.

**CAHANŞÜMULLUQ** *is.* Bütün dünya üçün əhəmiyyətli olma, dünyaya yayılma, dünyada tanınma, böyük tarixi əhəmiyyəti olma.

**CAH-CALAL** *is.* [*ər.*] Calal, ehtişam, büsat, dəbdəbə, təmtəraq, var-dövlət, əzəmət. *Keçmişdəki.. cah-calaldan, mal-dövlətdən, sövt-sədadan şair bir əsər görməyib.. əhvalatı necə ki var, artıq məharətlə öz dustihəqiqisi olan Mirzə Fətəli Axundzadəyə yazır..* F.Köçərli. [Cahangir ağa:] *Belə cahcalaldan öz ixtiyarınla əl çəkmək istəmirsən.* S.S.Axundov. *Dəyişmərəm dost təbəssümünü dünyanın cah-calalına.* N.Rəfibəyli.

**CAH-CALALLI** *sif.* 1. Təntənəli, dəbdəbəli, təmtəraqlı, büsatlı, əzəmətli, möhtəşəm. *Cah-calallı saray. Cah-calallı ziyafət. – Gecə xanın evində cah-calallı bir məclis qurulmuş, sazandalar öz yerlərini tutmuşdular.* Ə.Məmmədxanlı. [Abbas ağa ilə Mahmud] *danışa-danışa xeyli yol gəlmişdilər. Bu zaman qarşıdan gələn cah-calallı bir dəfn mərasiminə rast gəlib, söhbətlərini kəsdilər.* P.Makulu.

2. Qaş-daş içində olan, bəzəkli. *Leylək.. cah-calallı xanımın qabağında nə qədər qul kimi dayanıb onun ağ pambıq əllərinə su töksə də, xanım onu saya salmır, meydanın ortasına sancılan ələm ağacınca hesab eləmirdi.* S.Rəhimov.

**CAHIL** *sif. dan.* [*ər.*] Cavan, gənc. [Qulu:] [Yusif] *bəli, hələ cahıldır. Pis günlər görməyibdir.* N.Nərimanov. *Bu halda yanımıza bir suyuşirin, üzünurlu, cahıl gəlin gəldi, qucağında ay parçası kimi bir qız uşağı.* E.Sultanov. // *is. mənasında.* Cavan oğlan. [Məşədi İbad:] *..İndiki ahıllar, indiki cahıllardan min pay yaxşıdırlar.* Ü.Hacıbəyov. *Qədimdə belə bir qayda vardı: gəlin aparan zaman o məhəllənin cahılları faytonun qabağını kəsərdi.* H.Sarabski.

**CAHILBAŞI** *is. köhn. zar.* Məhəllə cahıllarına başçılıq edən, dikbaş, lovğa oğlan; ataman. *Cahılbaşı yavaşıdı. – Atan oldu behiştdə, bu başqa məsələ. Ver pulu, keçi qulun olsun.* S.Rəhimov.

**CAHILCA** *sif.* Çox cahıl, cavanca.

**CAHIL-CUHUL** *top. dan.* Cahıllar, cavanlar, cavan oğlanlar. *..Hamıdan da az danışan Qasım əmi və qeyri cahıl-cuhul idi..* C.Məmmədquluzadə. *Ağlamaq nədir ki, hətta bəzi cahıl-cuhullar axundun bu hərəkətinə yavaşca gülürlərdi.* Qantəmir. *Yeyib-içən, çalıb-çağıran, oynayıb-gülən, yelləncək minən hamısı cahıl-cuhuldu.* Ə.Əbülhəsən.

**CAHILLAŞDIRMA** "Cahıllaşdırmaq"dan *f.is.*

**CAHILLAŞDIRMAQ** *f.* Cahıl göstərmək, cavan göstərmək.

**CAHILLAŞMA** "Cahıllaşmaq"dan *f.is.*

**CAHILLAŞMAQ** *f. köhn. dan.* Cavanlaşmaq, gəncləşmək, cavan görsənmək. [Hacı Sadıq:] *Maşallah, gözüm dəyməsin, ağa gündən-günə cahıllaşır...* N.Vəzirov.

**CAHILLIQ** *is.* Cavanlıq, gənclik. *Cahıllıq zamanı keçibdir əgər; Yenə yüz naxələf oğlana dəyər.* Q.Zakir. [Şahnisə:] *Ay qədimi, deyəsən, cahıllığın yadına düşdü.* Çəmənzəminli. □ **Cahıllıq eləmək** – cavan tay-tuşları ilə avaralıq eləmək, vaxtını kefdə keçirmək. *Şeyx Şəbanın atası başmaqçı idi. Özü də bir neçə müddət atasının dükanında başmaqçılıq edib, axırda peşəsini unudub, bir neçə avara yoldaş tapıb qurşandı cahıllığa.* Ə.Haqverdiyev.

**CAHİL** *sif.* [*ər.*] 1. Oxumamış, savadsız, avam, nadan, anlamaz, qanmaz, heç şeydən xəbəri olmayan. *Ağ at ilə cahil ağaya qulluq eləmə.* (Ata. sözü). *Kaş bir qətrə meyə qiymət olaydı min can; Düşməyəydi bu qədər cahilü nadan əlinə.* S.Ə.Şirvani. *Ev-eşik, uşaqlar zəhmətsevməyən, lovğa, cahil Tamaşanın öhdəsində qaldı.* Ə.Əbülhəsən.

2. B a x **cahıl**. [Pərviz Rüstəmbəyə:] *Deyəsən, sən də ayılırsan, – dedi. – Bəs necə, cahil, cavan deyilmi?* Çəmənzəminli.

**CAHİLANƏ** *sif.* və *zər.* [*ər.* cahil və *fars.* ...anə] Avam-avam, cahilcəsinə, avamcasına, nadancasına, anlamazcasına. *Cahilanə hərəkət. – ..Biçarə qırmızısaqqallılarımız bu cahilanə təriflərə inanıb .. min-min məşəqqətlə pul tapıb Hicazə gedirlər.* "Mol. Nəsr.". *Rzaquluxan Böyükxanımın cahilanə söhbətinə qulaq verirdi.* M.S.Ordubadi.

**CAHİLİYYƏ** *is.* [*ər.*] *tar.* Ərəblərdə müsəlmanlıqdan əvvəlki dövr. *Cahiliyyə dövrünün bütləri.*

**CAHİLLİK** *is.* Nadanlıq, avamlıq, bilməzlik, şüursuzluq, düşüncəsizlik, cəhalət. [Münəvvər:] *İnsan eşitdiyi sözün natiqinə baxıb haman sözü qəbul edər. Ancaq məni dilgir edən camaatın cahilliyidir.* M.S.Ordubadi.

**CAİZ** *sif.* [*ər.*] Hər hansı bir baxımdan edilməsinə, görülməsinə, işlənməsinə icazə verilən; icazəli, rüsxətli, ən münasib, ən uyğun. [Xacə] *fikir etdi ki, qibleyi-aləmin sualında həqiqəti gizlətmək caiz deyil.* M.F.Axundzadə. [Əbülhəsənbəy:] *Eşq, məhəbbət məktubunu gündüz yazmaq caiz deyil! – dedim, – onu gecə saat birdən sonraya buraxmalısan.* M.S.Ordubadi. [Səfi bəy:] *Həcər*

*xanım, düşmənin ailəsinə mərhəmət etmək caizmidir?* S.S.Axundov. ☐ **Təbir caizsə, təbir caiz görülsə** *köhn.* – əgər belə demək olarsa. *Təbir caiz görülsə, demək olar ki, Hacı Aslan bu küçənin can damarı misalında idi.* S.Hüseyn.

**CALAQ** *is.* 1. *bot.* Bir bitkinin başqa bitki ilə calaqlanma nəticəsində inkişaf etmiş hissəsi; peyvənd, qələm. *Calaq yaxşı tutub.* // Calaq edilmiş, calaq nəticəsində alınmış. *Calaq gilas. – Calaq almalar, peyvənd armudlar, şumal gilaslar, qoşa düyüm zoğallar, şiv qələmlər elə qəşəng sallanmışlar ki, adam baxdıqca baxmaq istəyir.* Ə.Vəliyev. ☐ **Calaq etmək (vurmaq)** – 1) calaqlamaq, peyvənd etmək, qələm eləmək. *Biz gərək təzə-təzə bağ düzəldək, peyvəndlər edək, cır ağaca cins calaq vurub, ondan qızıl alma dərək.* S.Rəhimov. *Qonşulardan kim onu; Çağırsaydı gedərdi; Bağ kəsər, şitil əkər; Yaxşı calaq edərdi.* M.Rahim; 2) bir şeyin yanına tikmək, calamaq.

2. Qoşma, qoşulmuş şey.

**CALAQALTI** *is. bot.* Calaq (peyvənd) üçün götürülən bitki (ağac və s.). // Sif. mənasında. *Qoca calaqaltı bitkinin daxilində gedən maddələr mübadiləsinin təsirilə cavan bitkinin qələmləri yeni irsi xassələr kəsb edib, tamamilə başqa keyfiyyətli bir bitkiyə çevrilir və bu vasitə ilə vegetativ hibrid alınır.* M.Abutalıbov.

**CALAQÇI** *is.* Calaq vurma, calaqlama işini yaxşı bilən və bu işlə məşğul olan adam (bağban). [Heydər] *həm də bizim beş mindən artıq meyvə ağaclarının baş bağbanı, bünövrə calaqçısıdır!* S.Rəhimov.

**CALAQÇILIQ** *is.* Calaq vurma peşəsi, işi. [Müşavirədə] *toxumların yoxlanması, arxların çəkilməsi, həmçinin bağçılıq, calaqçılıq, arıçılıq işləri üzərində də xeyli dayanıldı.* S.Rəhimov.

**CALAQLAMA** "Calaqlamaq"dan *f.is.*

**CALAQLAMAQ** *f. k.t.* Bir bitkinin bu və ya başqa keyfiyyətini başqa bitkiyə aşılamaq üçün onun bir hissəsini (qələmlik) calaq (peyvənd) yolu ilə həmin bitkiyə calamaq, köçürmək; peyvənd etmək, qələm eləmək.

**CALAQLANMA** "Calaqlanmaq"dan *f.is.*

**CALAQLANMAQ** *məch.* Calaq edilmək, peyvənd edilmək.

**CALAQLATMA** "Calaqlatmaq"dan *f.is.*

**CALAQLATMAQ** *icb.* Calaq vurdurmaq, calaq elətdirmək.

**CALAQLI** *sif.* Calağı olan, calaqlanmış, calaq edilmiş. *Calaqlı ağac.*

**CALAL** *is.* [*ər.*] Əzəmət, ehtişam, dəbdəbə, təmtəraq, büsat. *Dağlarda nə calaldı; Ovçular macal aldı; Bir gözüm yar yolunda; Bir gözüm əcəl aldı.* (Bayatı). *Hey baxıram yurdumuzun dastan olmuş calalına; Dağlar, daşlar qanad verir bir şairin xəyalına.* S.Vurğun. *Bu calal, bu şövkət, bu şan mənimdir.* M.Rahim.

**CALALLI** *sif.* Dəbdəbəli, təmtəraqlı, ehtişamlı, əzəmətli. *Calallı imarət.*

**CALAMA** "Calamaq"dan *f.is.*

**CALAMAQ** *f.* 1. Calaq etmək, calaqlamaq. *Yaz başı cır ağacları calamaq.* – [Qoca:] *Bu beş qanad, beş çubuq idi. Özüm kəsib gətirdim, caladım.* S.Rəhimov.

2. Bir-birilə bağlamaq, rəbt etmək, qoşmaq, yapışdırmaq. [Hatəm xan ağa:] *Dörd ağacı bir-birinə calayıb, adını kürsi qoyub, Məhərrəm bəyin qırğısıtək üstünə qonub.* Ə.Haqverdiyev. *Dörd-beş çadırı bir-birinə calayıb, həyətdə meydan kimi mağar qurmuşdular.* B.Bayramov. // Məc. mənada. *Allah onun ömründən kəssin, calasın sizin kimi dostların ömrünə.* "Mol. Nəsr.". [Səlim bəy:] *Heç keçən günlərdən danışma. Keçən günə gün çatmaz, calasan günü-günə. Qədim vaxt murov vədimdə görürdün ətraf bəyləri cəm olub ov binası qoyublar.* Ə.Haqverdiyev.

3. *məc.* Qatmaq, qarışdırmaq, qoşmaq, bağlamaq. *Xahiş edirəm bu işə məni calama. – Bu yamandır ki, eşitməzkən adın; Məni sən gör kimə qoşdun, caladın?* M.Müşfiq. [Dostum:] *Eşitmişəm otaq axtarırsan, gəl səni bir xeyirli yerə calayım.* Mir Cəlal.

4. Bir işin arasıkəsilməzliyini, ara vermədiyini bildirir. ☐ **Papirosu papirosa calamaq** – ara vermədən, dalbadal papiros çəkmək. *Axşam saat doqquzda Ağabala.. dayanıb papirosu papirosa calayırdı.* Mir Cəlal. **Sözü sözə calamaq** – ara vermədən danışmaq, bir nəfəsə danışmaq. *Yoldan qayıdan, yola gələn adam ümumun fikrini məşğul*

*edən Rüxsarə barəsində sözü sözə calayır, artırır, əskildir və yaradırdı.* S.Rəhimov.

5. Tökmək (maye şey haqqında). *Elə gün olurdu ki, ətraf kənddən gələn südü alan olmurdu. Sənin canın üçün, dəxi geri aparmaq istəmirdilər, südü yerə calayırdılar.* C.Məmmədquluzadə. *Tahirin üstünə elə bil qaynar su calamışdılar.* M.Hüseyn.

**CALANMA** “Calanmaq”dan *f.is.*

**CALANMAQ** *f.* 1. Calaq edilmək, peyvənd edilmək, qələm edilmək. *Calanmış* (f.sif.) *ağac.* // Yaxşı tutmaq (peyvənd, qələm). *Qələm yaxşı calanmışdır.*

2. *məc.* Bağlanmaq, rəbt olmaq. *Yenə gün calanır; Ötən günlərə; Mən sənə yaxınam; Sən mənə uzaq.* N.Xəzri. [Şair:] *Bu yol mənim dövlətim; Bu yol mənim varımdır; Bir-birinə calanan; Polad misralarımdır.* B.Vahabzadə.

3. Tökülmək, axıb tökülmək. [Ruqiyyə xanım] *əlini qaldırdığı qədəhlə bərabər masanın üzərinə çırpdı. Şərab tamamilə süfrəyə calandı.* S.Hüseyn. *Yağış bir sel axını kimi göydən yerə calanır.* Ə.Məmmədxanlı.

4. *məc.* İlişmək. [Əşrəf Bahara:] *Yoxlamamış, bilməmiş birisinə calandıq, ondan ibrət olmadı..* B.Bayramov.

**CALAŞDIRMA** “Calaşdırmaq”dan *f.is.*

**CALAŞDIRMAQ** *f.* 1. Birləşdirmək, calamaq, qoşmaq, aralarında rabitə yaratmaq. [Kərəmov:] *Salmanov, götür telefonu, məni rayon icraiyyə komitəsi ilə calaşdır.* S.Rəhman.

2. *dan.* Əsassız olaraq isnad etmək, boynuna atmaq, yaxmaq. *Bir gün təzə arvad bir oyun da düzəldir: padşahın oğluna böhtan calaşdırır.* Çəmənzəminli.

**CALAŞIQ** *sif.* Calaşmış, yapışıq, bitişik halda olan. [Qapı] *Ağayevin evinə calaşıq bir tövləyə çıxır.* S.Rəhman.

**CALAŞMA** “Calaşmaq”dan *f.is.*

**CALAŞMAQ** b a x **calanmaq**.

**CALATDIRMA** “Calatdırmaq”dan *f.is.*

**CALATDIRMAQ** *icb.* Calaq işi gördürmək (birinə).

**CALATMA** “Calatmaq”dan *f.is.*

**CALATMAQ** b a x **calatdırmaq**.

**CAM[1]** *is.* [*fars.*] Vaxtı ilə misdən, indi isə müxtəlif materiallardan hazırlanan piyalə, qədək, kasa. [Züleyxa] *bir əlində bir cam su, o birində yeddi açar darvazanın arxasında durub, çərşənbə dəyişərdi.* Çəmənzəminli. *Qumru başaqdan gətirdiyi taxıldan döyüb, bir cam arıtmışdı.* Mir Cəlal. ☐ **Cami-Cəm** *klas.* – İran əsatirində: şərabın ixtiraçısı sayılan Cəmin [Cəmşidin] mövhumat qəbilindən olan sehirli qədəhi – klassik şeirdə adətən şərab mənasında işlənir. [Xəyyam:] *Biz güləriz batsa da şahlar yasa; Birsə məzarında gəda, padşah; Cami-Cəm olsun bizə ən son pənah!* H.Cavid.

◊ **Bir cam su içmək kimi** – çox asan. [Dərviş:] *Xanımcan, belə işlər mənim cadumun məqamında elə asandır, necə ki, bir cam su içmək.* N.Vəzirov.

**CAM[2]** *is.* [*fars.*] *köhn.* Şüşə.

**CAMAAT** *is.* [*ər.*] Bir yerə toplanmış adamlar, xalq kütləsi. *Nümayişdə xeyli camaat iştirak edirdi. – Camaatdan “urra” səsləri ucaldı və musiqi alqış marşları çaldı.* H.Nəzərli. // Ümumiyyətlə, adamlar. *Camaatı çağırın, danışaq. Bu işdən camaatın xəbəri yoxdur.* – [İmran:] *Camaatımız azlıq eləyir.* M.Hüseyn. [Aydın Səkinəyə:] *Siz bu gün tənəffüs zamanı camaatı yığın..* H.Seyidbəyli. // Əhali. *Kənd camaatı.*

**CAMAATLIQ** *is.* Bütün camaat üçün, hamı üçün; camaata məxsus, ellik. [Qadir:] *Bunu camaatlıq etsəydilər olmazdımı?* Ə.Əbülhəsən.

**CAMADAR** *is.* [*fars.*] Hamamda paltarabaxan, paltarsaxlayan xidmətçi. *Camadarın şahlığı hamamçılıqdır.* (Ata. sözü). *Bir kənarda bir neçə nəfər camadar, əllərində qırmızı fitə, balaqları çirməli dayanıbdırlar.* Ü.Hacıbəyov. *Əbülfəz bu yoxsul camadar qızını* [Səltənəti] *qızıl gücünə, daş-qaş bahasına ovlamışdı.* Ə.Vəliyev.

**CAMADARLIQ** *is.* Camadarın işi, peşəsi. *Camadarlıq eləmək.*

**CAMAXATAN** *is.* [*fars.*] *köhn.* Yorğan-döşək, sandıq və s. qoymaq üçün divarın içində açılan dördkünc oyuq. *Yorğan-döşəyi camaxatana yığmaq. Camaxatan pərdəsi.*

**CAMAXATANLI** *sif.* Camaxatanı olan. [Veys:] *Camaxatanlı, taxçalı və tamam kənd qaydası ilə döşənmiş olan böyük otağın aşağı başındakı şkafa yaxınlaşdı.* Ə.Əbülhəsən.

**CAMAL** *is.* [*ər.*] *şair.* Gözəllik, üz gözəlliyi. *Camalın görəndə daldalanır ay; Günün*

*nə həddi var çıxa üzünə!* Q.Zakir. *Gözümdən çəkilmir xəyalın sənin; O şirin gözlərin, camalın sənin; Hələ gözəlliyin dursun bir yana; Dünyaya dəyərdi kamalın sənin.* R.Rza.

**CAMALLI** *sif.* Gözəl, göyçək, qəşəng, gözəlüzlü.

**CAMAŞIR** *is.* [*fars.*] Alt paltarı, köynək-tuman, dəyişək. [Çingiz:] *Qəmər, cəld çamadanı içəridən gətir, kitabları qoy, camaşırlarımı gətir.* S.S.Axundov. [Ev xanımı:] *Qulluqçu camaşır dalınca getmişdir.* T.Ş.Simurq.

**CAMAŞIRÇI** *is.* Camaşır yumaqla məşğul olan adam. *Camaşırçı qadın.*

**CAMAŞIRÇILIQ** *is.* Camaşırçı işi.

**CAMAŞIRXANA** *is.* [*fars.*] Paltar yumağa məxsus yer, paltar yumaqla məşğul olan müəssisə. *Süfrə, dəsmal, pərdə və qapı-pəncərə örtüklərinin yuyulması üçün ayrıca camaşırxana açılması işi bu sahəyə sərf edilən xərcləri 50 faiz azalda bilər.* (Qəzetlərdən).

**CAME[1]** [*ər.*] *köhn.* 1. *sif.* Toplayan, cəm edən.

2. *is.* Toplama yeri.

3. *sif.* İçinə alan, ibarət olan.

4. *is.* Yekun.

**CAME[2]** *is.* [*ər.*] Böyük məscid. *Came nə qədər böyük olsa, imam yenə bildiyin oxur.* (Ata. sözü). *Midhət .. düşündü və bu iki nemətı* [hürriyyət və gözəlliyi] *yalnız Süleymaniyyə cameində tapacağına qane oldu.* Çəmənzəminli. *Gəl çıxaq bu camein möhtəşəm binasından; Yaşılgözlü Bosforu seyr eləyək bircə an.* N.Rəfibəyli.

**CAMƏ** *is.* [*fars.*] Paltar, camaşır. *Çak eylədi camə, çəkdi nalə; Halı bədəl oldu özgə halə.* Füzuli. *Qoysun başına molla gərək üç pud əmmamə; Yay, qış ola əynində onun bir cürə camə.* Ə.Qəmküsar.

**CAMIŞ** *is.* Qısaboyunlu, irigövdəli gövşəyən ev heyvanı. *İnək, camış, qoyun, quzu çıxar naxıra otlağa; Köçər arandan el, gedər yavaş-yavaş yaylağa.* A.Səhhət. *Qərənfil bacı həyətdə camış sağırdı.* İ.Əfəndiyev.

**CAMIŞÇI** *is.* Camışçılıq mütəxəssisi. // Camış saxlamaqla, camışçılıqla məşğul olan adam.

**CAMIŞÇILIQ** *is.* Camış yetişdirmə, camış saxlama. *Camışçılıq təsərrüfatı.*

**CAMLI** *sif.* Şüşəli, vitrinli. *Artıq şəhərin iri, geniş küçələrilə gedirdik: hər zaman gözümüzün alışdığı küçələr, böyük evlər, iri camlı mağazalar..* A.Şaiq.

**CAN** *is.* [*fars.*] 1. Dini etiqada görə, ölümlə vücuddan ayrılan qeyri-maddi varlıq; ruh. *Hələ canı var. – Çıxmayan cana ümid var.* (Məsəl). *Südlə gələn canla çıxar.* (Ata. sözü). *Səni canan sanıram, çıx bədənimdən, ey can!* Füzuli. *Kərəm deyər: Haqq buyurdu ayəndə; Can hava quşudu, durmaz bu təndə.* "Əsli və Kərəm". *Könül həsrət, can müntəzir, göz yolda; Ömr azaldı, vədə keçdi san ilə.* M.V.Vidadi.

2. Həyat, varlıq. *Canını qoymaq. Canını əsirgəməmək.*

3. Tab, taqət, hey. *Səndə heç can yoxdur. Onda heç can qalmayıb.*

4. Bədən. *Canım ağrıyır. Canına üşütmə düşmək. – Mən aşıq ahü-zarda; Canım dərddə, azarda. O gündən ki qul oldum; Satırlar hər bazarda.* (Bayatı).

5. Adam, insan, fərd. *Əziziyəm, nə qandır; Gözdən axan nə qandır; Daş deyil, kəsək deyil; Rəhm eylə, bu ki candır.* (Bayatı). *Köç edib yaylağa ellər, obalar; Bulaqlar başına min bir can gəlir.* Aşıq Şəmşir.

6. *məc.* Bir şeyin əsası, mahiyyəti, məğzi. *Məsələnin canı. Sözümün canı.*

7. **Canım, canım-gözüm** şəklində – 1) mehribanlıqla müraciət məqamında. *Canım-gözüm, de görüm nə istəyirsən?* 2) etiraz, narazılıq məqamında. *Canım, nə düşmüsən üstümə.* – [Qoca kəndli:] *Canım, boş qışqırmağın yeri yoxdur.* Ə.Haqverdiyev. [Musa sahibkara:] *Yox, canım, mən.. Sabirin şerini oxuyurdum.* S.Vəliyev.

◊ **Can alıb, can verir** – məftunedici gözəlliyə, dilbərliyə işarə. *Bir qızım var ki, bu cahan canı; Can alır, can verir kaman qaşı.* S.Ə.Şirvani. *O gərgin qaşların kölgəsindəki; Can alıb, can verən gözlərə qurban.* Ə.Cavad. **Can almaq** – b a x **canını almaq**. *Məgər ol mah tamam ömrdə bir yarı gecə; Çıxıban busə verə, can ala, nöqsan eylər?* S.Ə.Şirvani. *Bir nəğməydi ağ suların axını; Nərgizlərin can alırdı baxışı.* M.Rahim. **Can atmaq** – bir şeyi əldə etməyə və ya həyata keçirməyə həddindən artıq səy gös-

tərmək, bütün varlığı ilə çalışmaq. [Səriyyə:] *Havalar yaxşı keçdiyindən biz tələsir, payız yağışları başlayana qədər işləri görüb qurtarmağa can atırıq.* İ.Əfəndiyev. *Quş uçmağa can atıb, bir qədər yüyürdü.* M.Rzaquluzadə. [Bəhlul:] *Sənin oğlun da, lap çoxdandır, sən bunu bilirsən, bu cavanların sırasına qoşulmağa can atır.* İ.Hüseynov. **Can bahasına** – qan tökərək, özünü ölümə verərək, canını qurban edərək. *Həqiqətdə də hərgah Aslan canının bahasına belə oturacaq bir çarə tapsaydı, öz canını əsirgəməyib, Mansuru bu dərddən azad edərdi.* C.Cabbarlı. **Can bəsləmək** – özünə yaxşı qulluq etmək, rahatlığına, yemək – içməyinə fikir vermək. **Can çəkmək** – tənbəllik eləmək, bir işi çox könülsüz görmək, zorla eləmək, eləmək istəməmək. [Məşədi İman:] *Rəhmətliyin uşaqları, pulu alanda alırlar, verəndə can çəkirlər.* Ə.Haqverdiyev. [Altun bay:] *Torpağıma qarşı töycü verməyə də can çəkirsiniz.* C.Cabbarlı. **Can çürütmək** – bax **can qoymaq**. [Əhməd:] *Mən on beş il qara gün içində can çürüdüb təhsil alım, sonra da bu canımı, bu biliyimi qurban verim?* A.Şaiq. [Tamaşa qarı oğluna:] *Axı hökumət yolunda can çürütmüşəm. Plan plan dalınca doldurmuşam.* Ə.Əbülhəsən. **Can damarı** – bir şeyin özülünü, əsasını təşkil edən mühüm cəhət. *Təbir caiz görülsə, demək olar ki, Hacı Aslan bu küçənin can damarı misalında idi.* S.Hüseyn. **Can damarını tutmaq** – bax **damarını tutmaq**. **Can deyib, can eşitmək** – çox mehriban, səmimi olmaq. [Bənövşə:] *Nə olub, yoxsa aranız soyuqdur. Bəs bir neçə il bundan qabaq can deyib, can eşidirdiniz?* S.Rəhman. *İnsana könül həmdəmi hər şeydən fərzdir. Can deyib, can eşidəsən, bir-birinin başına and içəsən.* Mir Cəlal. **Can evi** – *məc.* Ən həssas yer, ürək, könül. *Vurdu can evini yaman ayrılıq..* Şəhriyar. *Can evimə sığışmayan arzular; Bir dünyada neçə dünya arzular..* S Vurğun. **Can gəzdirmək** – zorla ayaq üstə durmaq, çox üzgün, taqətsiz olmaq. *Halı pisdir, can gəzdirir.* **Can qalmamaq** – tamam üzülmək, taqətdən düşmək, əldən-dildən düşmək. *Xülasə, kəndə yetişənə kimi mənimki mənə dəyib, lap ölüb getmişəm, dəxi məndə can qalmayıb.* C.Məmmədquluzadə. [Orxan:] *Məndə artıq can qalmamış, mərhəmət!; Mərhəmət qıl, insafsız olma, İsmət!* H.Cavid. **Can qoymaq** – müqəddəs bir iş uğrunda canından keçmək, özünü fəda etmək. *And içirik bu dərəyə, bu dağa; Əcdadımız can qoyduğu torpağa.* R.Rza. [Böyük xanım:] *..Müharibədə can qoyan adamın balasını nöş belə gözümçıxdıya salmısınız?* B.Bayramov. **Can qoymamaq** – çox incitmək, əziyyət vermək, tamam əldən salmaq. *Futbol uşaqda can qoymadı.* **Can üstə olmaq** – axır dəqiqələrini yaşamaq, can vermək. *Deyir: "Qoy isinsin, o, can üstədir; Əziyyət çəkməsin bir neçə günlük".* M.Rahim. *Şair yatır xəstədir; Deyirlər, can üstədir.* B.Vahabzadə. **Can vermək** – 1) son dəqiqələrini yaşamaq, can üstə qoymaq. [Səlma:] *Həsrəti könlündə can verən övlad; Ah! Qəhrəman oğul! Nakam Qanpolad!* H.Cavid. *Qılınclar, nizələr keçdi döşündən; Cəllada can verdi, dilində: "Vətən!".* S.Vurğun. [Aslan] *özünü anasının yanına yetirdikdə onun can verdiyini görür.* S.Vəliyev; 2) *məc.* diriltmək, canlandırmaq, həyat vermək. *Torpağa can verirsən; Dilsiz daşları belə; Sən dilə gətirirsən.* B.Vahabzadə; 3) *məc.* ruhlandırmaq. *Təmiz hava kimi, sərin su kimi; Şair, şeirlərin mənə can verdi.* Aşıq Hüseyn. **Can yandırmaq** – 1) qayğısına qalmaq, qeydini çəkmək, dərdinə qalmaq. *Qarı Kərbəlayını özünə oğul hesab edib, ona artıq can yandırardı.* Çəmənzəminli; 2) ürəklə çalışmaq, səy göstərmək. [Sədr:] *..Öz işimizdir, gərək can yandıraq.* İ.Əfəndiyev. [Şah İsmayıl:] *Bizdən nə istəyirsiniz? .. Düşüncəli olmaq, can yandırmaq.* Ə.Sadıq. **Cana dolmaq** – bax **ətə-cana dolmaq (gəlmək)**. **Cana gəlmək** – 1) zəhləsi getmək, təngə gəlmək, darıxmaq, bıqmaq, usanmaq. *Bəs deyilmi, baxdım sənin sözünə; Bəs deyilmi, burda gəldim cana mən?* M.Müşfiq; 2) dirçəlmək, dirilmək, canlanmaq. [İnək] *başını, boğazını, kürəyini ucdantutma yaladıqca, sanki buzov cana gəlir, dirçəlirdi.* M.İbrahimov. *Qurumağa üz tutmuş ağaclar su içib cana gəldilər.* Ə.Məmmədxanlı. *Torpaq cana gəldi, yer cana gəldi; Tıpır-tıpır*

*yağan yay yağışından.* B.Vahabzadə. **Cana gətirmək (doydurmaq)** – 1) təngə gətirmək, bıqdırmaq, bezikdirmək, usandırmaq. [Xortdan:] *İblisi cəhənnəm əhli bir növ cana gətirmişdi…* Ə.Haqverdiyev. [Babək:] *Xəlifə və sarayın hədsiz-hesabsız vergiləri hamını cana gətirib…* M.Rzaquluzadə; 2) dirçəltmək, diriltmək, canlandırmaq. *Gülə sənsiz nəzər etsəm, gətirər canə məni.* S.Ə.Şirvani. *İşıqlar yayılır burdan hər yana; Su cana gətirir boz torpaqları.* H.Hüseynzadə. **Cana sinmək** – b a x **ürəyə yatmaq**. **Cana yetirmək** – b a x **cana gətirmək**. *Ey bivəfa, məni cana yetirdin; Munca cövrü-cəfa birdən olurmu?* Q.Zakir. **Canbir qəlb(də)** – çox yaxın, çox mehriban, səmimi. *Canbir qəlb yaşamaq. İki ailə canbir qəlbdə yaşayır. – Birgə oynadığım, qoşa gəzdiyim; Yoxsul qonşuların uşaqlarıydı; Biz ki canbir qəlbdə dost idik, deyim; Dostluq sudan duru, aydan arıydı.* N.Xəzri. **Candan düşmək** – üzülmək, zəifləmək, əldən düşmək. **Candan eləmək** – öldürmək, həyatdan məhrum eləmək. *Mən aşiqəm, dərdin üz; Güldü bağban, dərdin üz; Ya məni candan eylə; Ya canımdan dərdin üz.* Sarı Aşıq. [Aftil İbada:] *Sən iki arvadı candan eləmisən.* C.Cabbarlı. **Candan keçmək** – b a x **canından keçmək**. [Kərəm:] *Cavanam, candan keçmişəm; Gör necə dərdə düşmüşəm; Qan ağlayır elim mənim.* "Əsli və Kərəm". *Burda gördüm Vətən üçün; O tökülən al qanları; Burda gördüm el yolunda; Candan keçən aslanları.* B.Vahabzadə. **Candan-başdan keçmək** – b a x **canından keçmək**. *Qızıl gülü seçərlər; Budağından biçərlər; Vəfalı yar yolunda; Candan-başdan keçərlər.* (Bayatı). **Canı (… yanında) qalmaq** – birinin, ya bir şeyin nigarançılığını çəkmək, onun üçün narahat olmaq, intizar qalmaq. [Ağayarın] *canı məktəbdə, oğlunun yanında qalmışdı.* Ə.Əbülhəsən. **Canı (canın, canınız) sağ olsun!** – intonasiyadan asılı olaraq, təsəlli, sağlıq arzusu, yaxud narazılığı istehza şəklində bildirir (bəzən də üstüörtülü şəkildə hədə bildirir). [Hacı Əhməd Almaza:] *Ya səhv olub, ya elə belə demişsən, keçib gedib, canın sağ olsun!* C.Cabbarlı. **Canı (canın) yansın!** – qarğış ifadəsi. *Ay qız, canın yansın, haralardasan?* **Canı ağzına gəlmək** – üzülmək, usanmaq. **Canı ağzından (boğazından) çıxana qədər** – ölənəcən, son nəfəsə qədər. *İnsan canı ağzından çıxana qədər yaşamaqdan ümidini üzmür.* Ə.Abasov. **Canı boğazına yığılmaq (gəlmək)** – cana gəlmək, təngə gəlmək. *Hər dəfə, əl boyda qəbzlərə, ya dilucu tapşırığa, anbar açdırıb taxıl buraxanacan Gəldiyevin canı boğazına yığılırdı.* Mir Cəlal. [Fizzə xanım Fəridəyə:] *Vallah, adamlara yaxşılıq eləməkdən lap canım boğazıma gəlib.* Ə.Məmmədxanlı. **Canı cəhənnəmə!** – nə edir etsin, nə olur olsun, ölsün, cəhənnəmə ki mənalarında qarğış ifadəsi. *Canı cəhənnəmə, qoy getsin!* **Canı çıxmaq** – ölmək. *Qürbətdə çıxacaq canı Zakirin; Yoxdu xeyirxahı o yar yanında.* Q.Zakir. [Sona xanım:] *Yoxsa dustaq kimi qalmışam dörd divar arasında, xiffət eləməkdən az qalıb canım çıxsın.* Ə.Haqverdiyev. *Uşaq yerə dəysə idi, o saat canı çıxacaqdı.* Mir Cəlal. **Canı çıxsın!** – ölsün! (hirs, acıq məqamında işlənir). [Fatma xanım:] *İç, beşini iç, ağzınacan da qənd doldur, qazananın canı çıxsın!* N.Vəzirov. [Şərif:] *Uşaqdır, canı çıxsın, dilin saxlasın.* C.Cabbarlı. **Canı dincəlmək** – rahatlanmaq, rahat olmaq, sakitləşmək. [Şirinnaz] *hər zaman başıaçıq gəzər, o ətrafda yeganə olan içməli su aparmağa gəldikdə bir neçəsi ilə dalaşmayınca canı dincəlməzdi.* S.Hüseyn. **Canı … əlində olmaq** – birindən asılı olmaq. **Canı qurtarmaq** – azad olmaq, xilas olmaq, qurtarmaq. [Becan:] *Əgər dediyini eylədin – canın qurtardı, eləmədin – bütün nəslini kəsəcəyəm.* "Qurbani". [Məmməd:] *Kaş mən öləydim, biryolluq canım qurtaraydı..* E.Sultanov. **Canı od tutub yanmaq** – 1) bərk qızdırmaq, hərarəti artmaq. *Qızdırmadan uşağın canı od tutub yanır;* 2) *məc.* bərk hirslənmək, qəzəblənmək, odlanmaq. *Nahaq sözdən canım od tutub yandı.* **Canı sızıldamaq** – bədənində ağrı-sızı hiss etmək. [Mələkin] *canı sızıldayır, ağladığı səsinin titrəməsindən anlaşılırdı.* A.Divanbəyoğlu. **Canı suludur** – b a x **canında hələ su var**. *Yetmişdən artıq yaşamış Hikmət İsfahani, canı nə qədər sulu olsa da, axır mənzilə yaxın-*

*laşmışdı.* M.İbrahimov. **Canı üçün qorxmaq** – özünə xətər gəlməsindən ehtiyat etmək, qorxmaq, öz canının harayında olmaq. *Gülzar artıq öz canı üçün qorxurdu, zira müsəlmanlar həmişə belə bir xəyanəti və təhqiratı qan ilə yuyurlar.* C.Cabbarlı. **Canı yanmaq** – b a x **ürəyi yanmaq**. **Canım (canın, canınız, canı) üçün…** – and ifadəsi. [Qasım əmi oğluna:] *Oğlum, canın üçün, xalova deyərəm, sənə bir yaxşı çarxı xoruz gətirsin.* C.Məmmədquluzadə. [Kələntərli Əmirliyə:] *Bilsəydim ki, siz mədəniyyətlə iqtisadiyyatı belə qarşı-qarşıya qoyursunuz, canım üçün, heç ağzımı da açmazdım.* İ.Hüseynov. **Canım qurban!** – oxşama, əzizləmə, nəvaziş, yaxud yalvarış mənasında. [Kərbəlayı Qurban:] *Razısanmı? Canım sənə qurban!* Ü.Hacıbəyov. [Bəbir:] *Xala! Canım sənə qurban!* H.Nəzərli. **Canım sənə (sizə) desin…** – beləliklə, axırı ki, xülasə mənalarında ara söz kimi işlənən ifadə. *Sonra, canım sənə desin, günlərin bir günündə səni tutub salırlar türməyə.* "Kirpi". **Canına birə düşmək** – b a x **kürkünə birə düşmək**. **Canına cəfa basmaq** – özünə əziyyət vermək, zəhmətə dözmək. [Səməndər:] *Bu il fəhləyəm, canıma cəfa basıb oxuyaram, beş-altı ildən sonra olaram mühəndis.* M.Hüseyn. **Canına döşəmək** – bərk danlamaq, töhmətləmək, tənqid etmək. *O ki var canına döşədilər.* **Canına lərzə (uçunma, üşütmə, titrəmə) düşmək** – b a x **canına vicə (vic-vicə) düşmək**. [Ataş] *dinəndə elə tutarlı cavab verir ki, qabağındakının canına lərzə düşür.* Ə.Vəliyev. *Belə deyirlər ki, bu yaxınlarda dərvişlərin qulağına çatıb ki, tüfeyli həyat sürənlərlə ciddi mübarizə başlanıb. Bu xəbərdən onların canına üşütmə düşüb.* "Kirpi". **Canına od (atəş) salmaq** – 1) bərk qorxuya salmaq, təşvişə salmaq; 2) yandırıb-yaxmaq. *Eşq atəşi bir od salıb canıma; Yanmaqda yetişməz səməndər mənə.* Q.Zakir. **Canına vəlvələ düşmək** – bir şey olacağından qorxaraq bərk həyəcan keçirmək, təşvişə, vahiməyə düşmək. **Canına vəlvələ (qorxu) salmaq** – bərk qorxutmaq, təşvişə salmaq. **Canına vicə (vic-vicə) düşmək** – soyuqdan, ya qorxudan titrəmək, əsim-əsim əsmək. *Soyuqdan canına vicə düşdü. Dəhşətli xəbərdən canına vic-vicə düşdü.* **Canına yatmaq (sinmək)** – b a x **ürəyinə yatmaq**. *Yarməmmədin üzdən çox məsum görünən tərəfləri özü də hiss etmədən* [Rüstəmin] *canına yatırdı.* M.İbrahimov. **Canına yazığın gəlsin!** – özünə rəhm et, özünü əldən salma, öz canını düşün mənasında məsləhət ifadəsi. [Övrət ərinə:] *..Bir canına yazığın gəlsin, bir usan..* C.Məmmədquluzadə. *Salma özünü atəşi-piranə, a molla! Gəlsin yazığın canına, divanə, a molla!* M.Ə.Sabir. **Canında az yoxdur** – çoxbilmiş, gizlindən iş görən adam haqqında. **Canında hələ (su) var (su çoxdur)** – qocalığına baxmayaraq, hələ işləyə bilən, fəaliyyət göstərə bilən adam haqqında. [Camal:] [Pirinin] *qocalığına baxmayın, canında hələ su çoxdur.* M.Süleymanov. **Canında olmaq** – birinə xas olmaq, təbiətində, qanında olmaq. **Canından bezar olmaq** – usanmaq, təngə gəlmək; cana doymaq. *Canından bezar olan Tanrıya qarğar.* (Ata. sözü). **Canından əl çəkmək** – özündən bezikmək, təngə gəlmək, bıqmaq. [Məşədi İbad:] *Ayrı düşdüm yarımdan; Əl çəkmişəm canımdan.* Ü.Hacıbəyov. [Qaçay] *pambıq zavoduna gələndə həyatdan küsmüş, .. canından əl çəkmişdi.* Ə.Vəliyev. **Canından keçmək** – özünü qurban vermək, özünü fəda etmək, canını vermək. [Zalxa:] [Bayram] *Pərzaddan ötrü indi canından keçər, at, mal nə şeydir.* M.F.Axundzadə. *Ala gözlüm, səndən ayrı gülmərəm; Canımdan keçsəm də, ölə bilmərəm.* Aşıq Ələsgər. **Canından olmaq** – b a x **ürəyindən olmaq**. **Canını almaq** – öldürmək. *Sordun zəlitək sən hamının qanın, a molla! Aldın canını xəstə müsəlmanın, a molla!* M.S.Ordubadi. *Qorudum öz canımı vuruşlarda ölümdən; Canıma qıyanların canını almaq üçün.* S.Rüstəm. [Canbalayev:] *Bu dəfə də mənim ürəyimi kəsib atmaq, biryolluq canımı almaq istəyirsən.* İ.Hüseynov. **Canını azar (dərd) alıb** – tənbəl, həvəssiz, ürəksiz iş görən adam haqqında. [Şərəbanı:] [Əliqulunun] *canını azar alıb, nə güc vurur, nə itələyir.* C.Cabbarlı. **Canını bağışlamaq** – ölmək. *Vaxt gəldi, Əhmədin atası qəfildən azarlayıb canını bağışladı oğluna.* (Nağıl).

**Canını boğazına yığmaq (gətirmək)** – b a x **cana doydurmaq**. [Hacı Mehdi:] *Canımı boğazıma yığdınız.* Ə.Haqverdiyev. [Balaxan Aydına:] *Sən canımı boğazıma yığdın, bu xalqı kişi saymırsan?* C.Cabbarlı. **Canını çıxarmaq** – incitmək, əziyyət vermək. **Canını çölə atmaq** – öz canına zərər olacaq dərəcədə işləmək, canına fikir verməmək, öz qeydinə qalmamaq. *Elə bil canını çölə atıb, gecə-gündüz dincəlmək bilmir.* "Kirpi". **Canını çürütmək** – 1) b a x **ürəyini çürütmək;** 2) boş yerə zəhmət çəkmək, çalışmaq. **Canını dişinə tutaraq (tutub)** – könülsüz, həvəssiz, istəmədən, özünü məcbur edərək. [Səməd] *canını dişinə tutub, bacısını və Zeynəbi Nadirin yanına apardı.* B.Talıblı. [Topuş] *.. gözlərini yumub açdı və canını dişinə tutaraq, özünü başıaşağı Nərgizin ayaqlarına atmaq istəyirdi ki.. birdən səksənib divar üstündə dikəldi.* Ə.Məmmədxanlı. [Şofer:] *Müxtəsəri, canımı dişimə tutub, birtəhərlə özümü qayığa saldım.* M.Rzaquluzadə. **Canını işə verməmək** – zəhməti, işləməyi sevməmək, tənbəl həyat keçirmək, işdən boyun qaçırmaq. *Heç canını işə vermir.* **Canını qoymağa yer axtarmaq** – nə edəcəyini bilməmək, özünə yer tapmamaq, çaşıb qalmaq. **Canını qoymaq** – bütün qüvvəsini, enerjisini, bacarığını sərf etmək. [Rəis:] *Bu mükafat Baxış Baxışovun ailəsinindir. O kişi canını tikintidə qoyur.* Mir Cəlal. **Canını qurtarmaq** – özünü qurtarmaq, xilas olmaq, yaxasını qurtarmaq. [Məcid:] *Allah qüvvət versin, ay Nadir, bu bəylərin əlindən canın yaxşı qurtardı.* B.Talıblı. *Ay arvad, Allah istəsə heç kimi yoxsul yaratmaz deyə, Aslan kişi mətləbə dəxli olmayan müxtəsər bir cavabla canını qurtarmaq istədi.* Ə.Vəliyev. **Canını sıxmaq** – b a x **ürəyini sıxmaq**. *Naşad əfəndi heç də mətləbə dəxli olmayan lüzumsuz sözlərlə* [Mehribanın] *canını sıxırdı.* S.Hüseyn. **Canını tapşırmaq (təslim etmək)** – ölmək. *Ev sahibi çoxdan canını tapşırıb.* H.Seyidbəyli. [Kişi] *bir həftədən sonra canını tapşırdı.* Ə.Sadıq. **Canını vermək** – özünü qurban vermək, özünü fəda etmək, canından keçmək. [Məşədi İbad:] *A quzum, gəl yanıma; Canımı verərəm mən yarıma.* Ü.Hacıbəyov. *Namusla sürmüşəm öz dövranımı; Verərəm haqq üçün şirin canımı.* M.Rahim. **Canının hayında (harayında) olmaq** – ancaq özü haqqında düşünmək, öz qeydinə qalmaq. *Ağagül Nabatov bu xəbərdən şadlansa da, öz canının harayına qalıb əlləşir.* S.Rəhimov. *Bu saat Sərhəng öz canının hayındadır.* M.İbrahimov. **Canının qeydinə (dərdinə) qalmaq** – özünə fikir vermək, öz qeydinə qalmaq, sağlamlığını qorumaq. **Canlara dəyən (dəyər)...** – xoşxasiyyət, mehriban, nəcib, mərd, səmimi adam haqqında. [Ağca:] *A kişi, mən oğlanı görməmişəm, anası canlara dəyən bir adamdır.* H.Sarabski. [Dostum:] *Hər ikisi canlara dəyən oğlandır, Rəşidi tanıyırsan, bu da onun dostu və "rəqibi".* M.Rzaquluzadə. **Yarı canı qalmamaq** – çox arıqlamaq, üzülmək, zəifləmək. *Yoluna göz dikməkdən; Qalmayıb yarı canı.* (Bayatı). *Rəngi saralıb, qalmayıb əsla yarı canı; Bir gülməz oğul, vay!* M.Ə.Sabir.

**CANA-CUNA** *sif. dan.* Boş, bekara, dəyərsiz. [Şahbəy:] [Bülənd] *bir-iki araba ayın-oyunla camaatı necə ələ aldı! Cana-cuna adam deyil!* Ə.Əbülhəsən.

**CANALAN, CANALICI** *sif.* 1. Cəllad, adamöldürən, qaniçən. [Rüstəm:] *Bundan sonra mən canalıcı cəllada dönməliyəm...* C.Cabbarlı. //*məc.* Üzücü, çox əziyyətli. *Çox canalan işdir.*

2. *məc.* Füsunkar, məftunedici, dilbər. *Dilbilən, bir canalan, bir qəddi-şümşad almayım? Ömrümün axır dəmində almayım, şad olmayım.* Ə.Nəzmi. *Tovuzun canalıcı səsi* [Əhmədi] *dəlicəsinə məftun etmişdi.* M.Süleymanov. [Qızın] *canalıcı qaynar ala gözləri indi xüsusi bir qızğınlıqla parıldayır, ehtirasdan alışıb yanırdı.* V.Şıxlı.

**CANAMAZ** *is.* [*fars.*] *din.* Üstündə namaz qılmaq üçün xüsusi şəkildə tikilib hazırlanan dördkünc parça. *Qədim axşam evə qayıtdıqda, arvadının birisi onun üçün dəstəmaz almaq üçün su hazır etsəydi, o birisi canamaz hazırlayırdı.* T.Ş.Simurq. [Kişi] *bir bucaqda salınmış qələmkar canamaz üstə qiraətlə namaz qılır.* H.Sarabski.

**CANAN** *is.* [*fars.*] Sevgili, yar, dilbər, məhbubə. *Fələk ayırdı məni cövr ilə cana-*

*nımdan.* Füzuli. *Nə xoşdu canana canı yetirmək; Doyunca tamaşa eləyib ölmək.* Q.Zakir. [Tahir:] *El qəhrəmanlarının çoxusu canan yolunda min bir əziyyətə qatlaşır.* M.Hüseyn.

**CANASİNƏR** *sif.* və *zərf* Xoşagələn, canayatan, ürəyəyatan. *Canasinər iş. Canasinər hərəkət etmək. – Molla, indi ki bizi qonaq eləyirsən, gəl öz istədiyimiz kimi elə ki, canasinər yeyək.* "M.N.lətif.".

**CANAVAR** *is.* [*fars.*] 1. İt cinsindən dərisi boz, yırtıcı heyvan; qurd. *Kəhər at qulaqlarını şəkləyib, canavar tərəfə baxır, öküzlər böyrüşməkdə davam edirdi.* Ə.Vəliyev. *Çoban sürüyə canavar düşdüyünü zənn edib qışqırdı.* İ.Hüseynov.

2. *məc.* Çox qəddar, vəhşi, yırtıcı, rəhmsiz adam haqqında. [Durna:] *Sonra bir gün Əsəd bəy, o yırtıcı canavar; Məni kənddə yalqız görüb istədi ki, qaçırsın.* C.Cabbarlı. *Zaman çapır öz atını! Od parlayır süngülərdən; Rəzil düşmən yaralanmış yırtıcı bir canavardır.* S.Vurğun.

**CANAVARLIQ** *is.* Vəhşilik, yırtıcılıq, qəddarlıq. *Bütün, bu vəhşiliklərə, bu canavarlıqlara qulaq asmaqdan təngə gəlmiş Molla deyir..* "M.N.lətif.".

**CANAZAR** *sif.* [*fars.*] Cansız, arıq, zəif, sısqa. *Canazar uşaq.*

**CAN-BAŞ** *is.* Adamın cismani və mənəvi halı; canlı dildə səhhət mənasında işlənilir. *Canın-başın salamatdırmı? Canın-başın necədir? –* [Dostumun] *rast və gözəl qaməti əyilib, rəngi soluxub.. qərəz, canı-başı salamat, təndürüst və müqtədir bir halda ikən indi çox həqir və məyus görünürdü.* F.Köçərli. *Odur ki, canımız-başımız sağdır; Elin yanında da üzümüz ağdır.* S.Vurğun. *İyirmi dörd yaşlı, canı-başı sağlam, istiqanlı bir oğlan özünü nə qədər saxlayacaqdı.* M.İbrahimov.

**CANBAZ** *is.* [*fars.*] 1. Tamaşa yerlərində öz canı üçün təhlükəli oyunlar göstərən sirk artisti; kəndirbaz, akrobat.

2. *məc.* Oyunbaz. Hoqqabaz. [Piri:] *Şiraslan, yaxşı bilirik ki, canbazsan.* M.Süleymanov.

**CANBAZLIQ** *is.* 1. Canbazın işi, kəndir və ya at üzərində və s.-də göstərdiyi məharət, hünər.

2. *məc.* Hiyləgərlik, hoqqabazlıq, fırıldaqçılıq.

**CANBƏXŞ** *sif.* [*fars.*] *klas.* Can verən, canlandıran; həyatverən, adamı şad və məmnun edən, fərəhləndirən.

**CANBİR** *sif.* və *zərf* Çox yaxın, mehriban, ayrılmaz. *Canbir yoldaş. Canbir olmaq. Uzun əsrlərdən bəri can deyib, can eşidən gürcülər, azərbaycanlılar həmişə canbir, qəlbbir olmuşlar.*

**CANBİRLİK** *is.* Çox yaxınlıq, səmimilik, mehribanlıq.

**CAN-CAN: can-can demək** – çox mehribanlıq göstərmək, nəvaziş göstərmək, riqqət göstərmək. *Yetimə can-can deyən çox olar, çörək verən az.* (Ata. sözü).

**CANCIĞAZ** b a x **can-ciyər**. *O, mənim cancığazımdır.*

**CAN-CİYƏR** *is.* Çox yaxın, mehriban, canbir qəlbdə olan dostlar haqqında. *O, mənim can-ciyərimdir.* – [Dövlət bəy:] *Biz tanış-biliş, can-ciyərik, dostuq.* C.Cabbarlı. [Bülənd] *getdikcə atası Abdulla kişiyə nə qədər oxşayırdı. Bülənd – Veysin doğma qardaşı, canıciyəri gör necə danışırdı.* Ə.Əbülhəsən. // Ən əziz, ən istəkli, doğma. [Qarı Anriyə:] *O mənim yeganə oğlumdur, canım-ciyərimdir.* S.Vəliyev. □ **Can-ciyər olmaq** – bir-birinə çox yaxın, çox səmimi, çox mehriban dost olmaq. *Bu yaz dostlarım yenə bəxtəvər olacaqlar; Can-ciyər olacaqlar.* M.Müşfiq.

**CANÇƏKİŞMƏ(Sİ)** b a x **canvermə**. *Qəlbinin, nəbzinin çarpması, cançəkişmə zamanları son dəqiqələrini keçirməkdə olan xəstələrdə olan çarpmanın eynidir.* A.Şaiq.

**CANDANKEÇƏN** b a x **canındankeçən**.

**CANDƏRDİ** *zərf* Könülsüz, istəmədən, məcburi. *Candərdi getməli oldu. Bir şeyi candərdi eləmək. – Şamxalbəy candərdi də olsa, Şahbəyin cavabını verdi.* Ə.Əbülhəsən.

**CAN-DİLDƏN** *zərf* Ürəkdən, səmimiyyətlə, məmnuniyyətlə, böyük həvəslə, vicdanla, sədaqətlə. *Can-dillə işləmək.* – [Əliqulu:] *Ümidvaram ki, can-dillə qulluq edib, əmrinizi yerinə yetirərəm.* S.S.Axundov. *Onun xasiyyətinə "əhsən" deyib, can-dillə işi qurtarmağa çalışırdı.* Mir Cəlal.

**CANƏFZA** [*fars.*] *klas.* Canlandıran, canlandırıcı, ruhlandırıcı. *Müşkin saçından bulmuşam şol buyi-canəfzayi kim..* Nəsimi.

**CANFƏŞAN** *sif.* [*fars.*] Canını əsirgəməyən, canını fəda edən, canından keçən.

**CANFƏŞANLIQ** *is.* Həddindən artıq can yandırma, səy göstərmə, cəhd etmə. *Amma, mətəəssüf, müəllimlərin çoxunda bu rəviş, bu hərəkət və bu canfəşanlıq müşahidə olunmur.* F.Köçərli. [Səlim ağanın] *bu canfəşanlığı tacirə ləzzət verirdi.* M.Ibrahimov. *Ox qıjıltı ilə gələndə yasavulbaşı qondarma bir canfəşanlıqla özünü xanın qabağına verdi..* M.Rzaquluzadə. //*məc.* Həddindən artıq və ya yersiz hörmət göstərmə, əldən-ayaqdan getmə. [Məşədi Qəzənfər:] *Axşam da ki, toyda idik. Qərəz, çox canfəşanlıq oldu.* Ü.Hacıbəyov. ◻ **Canfəşanlıq etmək (göstərmək)** – həddən artıq səy göstərmək, çalışmaq, cəhd göstərmək. *Kosa kuryer də bu aləmin içində özündən çıxıb və kabineti nizama salmaq üçün böyük bir canfəşanlıq göstərirdi.* S.Rəhimov. *Mən düşünürdüm ki, bu adam o qadının yaxın qohumudur, çünki həddən artıq canfəşanlıq eləyirdi.* S.Rəhman.

**CANFƏZA** *sif. klas.* Ürəkaçan, fərəhverən, könülaçan. *Apardı könlümü bir xoş, qəməryüz, canfəza dilbər; Nə dilbər – dilbərişahid, nə şahid – şahidi-sərvər!* Həsənoğlu. *Müşkü ənbər saçından utandı; Canfəza müşk, tazə ənbərsən.* Nəsimi.

**CANGÜDAZLIQ** *is. klas.* Canyandıranlıq, canıyananlıq; fədakarlıq. *Şərm eylə bu eşqbazlıqdan; Bifaidə cangüdazlıqdan.* Füzuli. *Əgərçi bu növ cangüdazlıq* [Yusif Sərraca] *sadiq və xeyrəndiş dostlar bəhəm etdi, nəhayət, xırda bədbəxtliyinə bais oldu.* M.F.Axundzadə.

**CANGÜLÜM** *is.* Qızların dəstə ilə iki cərgədə üz-üzə durub oxuya-oxuya oynadıqları bir oyun adı. *Sənəm qız yoldaşları ilə bir yerdə yığışıb oynayırdılar və oxuyub qaval çalırdılar, .. "Cangülüm" oynayırdılar.* E.Sultanov.

**CANHACAN** *zərf* Ürəklə, məhəbbətlə, riqqətlə, nəvazişlə, oxşaya-oxşaya. *Canhacan uşağı qucaqladı. – Bir mənim başıma gəldimi hicran; Kim basdı bağrına canhacan səni?..* S.Vurğun. ◻ **Canhacan olmaq** – b a x **canbir olmaq**. *Bütün kolxozçular şadlıq eylədi; Sövkəndi bir-birinə, canhacan oldu.* Aşıq Mirzə.

**CANHÖVLÜ** b a x **hövlnak**.

**CANIBƏRK** *sif.* Davamlı, möhkəm, dözümlü, sağlam. *Canıbərk adam.*

**CANIBƏRKLİK** *is.* Davamlılıq, dözümlülük, möhkəmlik.

**CANIÇIXMIŞ** *is.* Yüngül qarğış sözü. [Ana:] *Oğul, yoluna qurban olum, nə vaxt gəldin ki, mən canıçıxmış bilmədim.* Q.İlkin.

**CANINDANKEÇƏN** *sif.* Bir iş və ya adam üçün canını verməyə, canını fəda etməyə, başından keçməyə hazır olan adam. *Vətən üçün canındankeçən əsgər.*

**CANIŞİRİN** *sif.* Əziz, istəkli, xətirli. *Bir də zəhmət verib, sizin kimi canışirin qonaqları tərpətməkdənsə, beləcə yaxşıdır…* S.Rəhimov.

**CANIYANAN** *sif.* Birinə ürəyi yanan, onun dərdinə qalan, qeydini çəkən, ona mehribanlıq və riqqət göstərən. *Vamiqin Üzra tək canıyananı; Məcnunun Leyli tək qəmküsarı var.* Q.Zakir. [Əlikram:] [Sənubər] *camaat arasında canıyanan kimi .. şöhrət qazanmaq istəyirsə, dövlətin kisəsinə girməsin!* B.Bayramov.

**CANIYANANLIQ** *is.* 1. Riqqət, şəfqət, ürəyiyananlıq; birinin dərdinə şərik olma, mehribanlıq, səmimiyyət göstərmə. *Müəllimənin canıyananlığı hamını heyran qoydu, o, gecə saat ikiyə qədər cənazədən ayrılmadı.* M.Hüseyn. ◻ **Canıyananlıq eləmək (göstərmək)** – ürəyi yanmaq, həmdərd olmaq, ürəkdən acımaq, yazığı gəlmək. [Qərənfil:] *İndi də başlamısınız Hümmətə canıyananlıq eləməyə.* İ.Əfəndiyev. *Bir dəfə nahar zamanı Fərman gənc fəhlələrlə danışarkən dostu ona yaxınlaşdı və süni bir canıyananlıq göstərdi.* Ə.Sadıq.

2. **Canıyananlıqla** şəklində – ürəyi yanarcasına, acıyaraq, yazığı gələrək, halına yanaraq. *Canıyananlıqla soruşmaq. – Dürdanə xanım canıyananlıqla dedi..* Ə.Əbülhəsən.

**CANIYANAR** b a x **canıyanan**. *Salman səsini ucaltmadan, guya doğrudan da canıyanar səslə dedi: – Elə mən də onu deyirəm, yoldaş Qoşatxan.* M.İbrahimov.

**CANIYANARLIQ** b a x **canıyananlıq** 1-ci mənada.

**CANİ** *is.* [*ər.*] Cinayət etmiş, cinayətkar. *Kimi cani .. düşünür fitnə-fəsad; Kimi zövq əhli, dilər hər kəsişad.* H.Cavid. *Sən vətənə*

*soxulan hər caniyə, hər yada; Zərbələr vuracaqsan yerdə, göydə, dəryada.* R.Rza. *Tərlanın qanla dolmuş gözlərindən qorxub dartınan cani yana doğru qaçmaq istərkən, bir nəfər oğlan da Tərlana tərəfdar çıxdı..* M.Hüseyn. // Sif. mənasında. [Mahmud:] *Aldığım xəbərə görə cani kazak buradan yola salınıbdır.* P.Makulu.

**CANİLİK** *is.* Cinayət etmə, cani olma; cinayətkarlıq.

**CANİŞİN** *is.* [*fars.*] 1. Bir mənsəb sahibini əvəz edən, onun yerində oturan şəxs. [Fərraş Səttara:] *Məgər sən özbaşınasan? O, şahzadədir, şahın oğludur, şahın canişinidir..* P.Makulu.

2. *tar.* Çar Rusiyasında: ucqar vilayəti padşah adından idarə edən və ali hakimiyyət hüquqlarına malik olan şəxs. *Oradan alınan xəbərlərə görə Sərdar Rəşid iki günün içərisində Qafqaz canişininə səkkiz teleqram göndərmişdi.* M.S.Ordubadi.

**CANİŞİNLİK** *is. tar.* 1. Canişin vəzifəsi, adı. // Canişin idarəsi. *Vəfadar Tiflisə canişinliyə getmək, orada paruçik İvanovla görüşmək barədəki xahişini bildirdikdə İdris razılıq verdi.* M.İbrahimov.

2. Canişinin idarəsi altında olan vilayət. *Qafqaz canişinliyi.*

**CANQURTARAN, CANQURTARICI** *sif.* Təhlükəli, çətin, çıxılmaz vəziyyətdən qurtaran, dardan qurtaran, dadaçatan. *Canqurtaran yol. Canqurtarıcı cavab.*

**CAN(LA)-BAŞLA** *zərf* Çox həvəslə, ürəkdən, səy və qeyrət göstərərək. *Can*(*la*)*-başla işləmək. Can*(*la*)*-başla razı olmaq. – Nə qədər varsa bu dünyada sevinc inciləri; Öz böyük qəlbinə can-başla yığırsan gecələr.* S.Rüstəm. *Fərman can-başla çalışmaq, işin nəzəri cəhətini öyrənmək sayəsində püxtələşmiş və öz işinin ustası olmuşdu.* Ə.Sadıq. [Hümmət Fərəcova:] *Çox gözəl, xoş gəlmisiniz, nə qulluğunuz olsa, can-başla təşkil etməyə hazırıq.* B.Bayramov.

**CANLANDIRICI** *sif.* Canlandıran, canverici, həyatverici, dirçəldici, gümrahlaşdırıcı. *Canlandırıcı dağ havası. Günəşin canlandırıcı hərarəti.*

**CANLANDIRILMA** "Canlandırılmaq"dan *f.is.*

**CANLANDIRILMAQ** "Canlandırmaq"-dan *məch. Vaqif əsərdə dövrünün həqiqi xalq qəhrəmanı, xalqın bütün mənəvi həyatı və zənginliklərinin tərcümanı kimi canlandırılmışdır.* M.Arif.

**CANLANDIRMA** "Canlandırmaq"dan *f.is.*

**CANLANDIRMAQ** *f.* 1. Can vermək, diriltmək. *Xanlar belə bir insanı canlandırıb yarada bilərmi?* S.Rəhimov. // Ayıltmaq, özünə gətirmək. *Özündən getmiş adamı canlandırmaq. – Bu fikirlər Veranı canlandırdı.* S.Rəhman. [Hüseyn:] *Onda canlandırar üfüqlər məni; İstəyənlər baxıb görərlər məni...* M.Rahim. // *məc.* Yeni həyat vermək, dirçəltmək, şənləndirmək; canlı göstərmək. *Dəmir yol ucqar yerləri canlandırdı.* – [Aktyor] *surətin fərdi, insani, psixoloji gözəlliyini və zəifliyini də canlandıra bilir.* M.İbrahimov. *Mühəndislər, fəhlələr gəldilər. Onlar boz səhranı canlandırdılar.*

2. *məc.* Unudulub getmiş, yox olmuş bir şeyi hafizədə bərpa etmək, yada salmaq, onun haqqında aydın təsəvvür yaratmaq. [Kərimxan] *xəyalında həyatının başqa sahələrini canlandırmağa çalışır.* M.İbrahimov. *İndi isə şairin şüuru bu gecə gördüyü xarabadan mütəəssir olaraq, bir vaxtlar zəif bir duman kimi tutub saxladığı o qorxunc mənzərələri yenidən canlandırır..* Ə.Məmmədxanlı.

3. *məc.* Gücləndirmək, fəaliyyətini daha da artırmaq. *Kənddə ticarəti canlandırmaq. İşləri canlandırmaq lazımdır. Dərnəyin fəaliyyətini canlandırmaq.*

4. Şənləndirmək, hərəkətə gətirmək. *Qəhrəman sakit olmuş məclisi canlandırdı.* Ə.Vəliyev.

**CANLANMA** "Canlanmaq"dan *f.is. Bir canlanma, bir şənlik var; Geniş sinif otağında.* M.Dilbazi. *Məclisdə əvvəlki şuxluq olmasa da, yenə canlanma, tərpəniş başladı.* B.Bayramov. *Beş-altı dükandan və zibilli meydançadan ibarət həftə bazarında böyük canlanma vardı.* Ə.Abasov.

**CANLANMAQ** *f.* 1. Dirilmək, dirçəlmək. *Canlanır yenidən sönən bir həyat; Nə gözəl yaraşır sizə ağ xalat!* S.Vurğun. [Bibixanımın] *solğunlaşıb altı kölgələnən gözləri elə*

*bil yenidən canlandı..* B.Bayramov. // Özünə gəlmək, ayılmaq. *Su içən kimi canlandım.*

2. *məc.* Daha fəal, daha sürətli, daha canlı getmək, fəallaşmaq. *Şirzad katibin gəlməsilə işlərin canlanacağını güman edib sevinirdi.* M.İbrahimov. *Şagirdlər bir-bir gəlir; Otaq birdən canlanır.* M.Seyidbəyli.

3. *məc.* Hafizədə, xəyalda bərpa olmaq, təcəssüm etmək, yada düşmək. *Yeddi il əvvəl..* [Xədicə ilə] *keçirdiyim saatlar tamamilə xəyalımda canlanmışdı.* S.Hüseyn. *..Ulduzun gözləri qarşısında isə yeddi nəfər döyüşçüsü ilə vuruşan Azadın son saatları canlanırdı.* Ə.Məmmədxanlı. // *məc.* Canlı bir şey kim görünmək. *Bu təpədən baxdıqda Bakının mənzərəsi bütün əzəməti ilə göz qarşısında canlanırdı.* S.Rəhman. *..İndi qarşımda canlanan mənzərə də bunların heç birinə bənzəmirdi.* M.Rzaquluzadə.

4. *məc.* Oyanmaq, dirçəlmək, cana gəlmək. *Təbiət canlanır, bahar çağıdır; Bağçalar, yamaclar çiçəklənmədə.* A.Şaiq. *İçdikcə içib doydu; Bol-bol yağışı torpaq; Canlandı şeh altında; İlk dəfə açan yarpaq.* M.Dilbazi. *Qış qurtarır, yer canlanır; Baharın xoş nəfəsilə.* B.Vahabzadə.

**CANLATMA** "Canlatmaq"dan *f.is.*

**CANLATMAQ** b a x **canlandırmaq**. *Mən səni canlatmağa; Yeni yollar bulurdum; Yeni oynaq qanadlar; Yeni qollar bulurdum.* M.Müşfiq.

**CANLI** *sif.* 1. Diri, sağ, yaşayan (*ölü* ziddi). *Canlı orqanizm. Canlı hüceyrə. – Ucalan heykəl canlı bir insan kimi görünürdü.* S.Rəhimov. // *is. mənasında.* Diri adam (heyvan), sağ adam (heyvan). *Bu kəndə getsən, ancaq arvad, uşaq və qoca kişilərdən başqa bir canlı görməzsən.* Ə.Haqverdiyev. *Mən də bir insanam, mən də canlıyam; Mənim də qəlbimin arzuları var!* S.Vurğun. // *məc.* Əbədi, daimi, ölməz. *Canlı obraz.* // Qurumamış, solmamış, tər. *Canlı çiçəklər. Canlı ağac.*

2. Canlılar və bitkilər aləminə mənsub olan; orqanik, üzvi. *Canlı təbiət. Canlı materiya. Canlı aləm. – Uşaq canlı həyatı daha yaxşı görməlidir.* S.Rəhimov. // İnsanlardan, heyvanlardan ibarət olan. *Canlı qüvvələr. Düşmənin canlı qüvvələri tükənmişdir.*

3. İri, yekə, zorba, möhkəm, qüvvətli. *Kabab qanlı, igid canlı.* (Ata. sözü). *Dəmirçioğlu atasından gizlin bir canlı kotan zəncirini də götürüb toqqa əvəzinə belinə bağladı, Çənlibelə tərəf yola düşdü.* "Koroğlu". *Novruz 30 yaşında, gödəkboy, canlı bir oğlan idi.* N.Nərimanov. *Yaşıl, düz və canlı qələmə ağacları baş-başa verib elə ucalır ki, deyərsən, bunlar havadan, günəşdən doymur.* Mir Cəlal.

4. *məc.* Fəal, qızğın, coşqun, işgüzar. *Canlı söhbət başlandı. Məşğələ çox canlı keçdi. – Azərbaycan .. ədəbiyyatı canlı bir yaradıcılıq həyatı keçirir..* M.İbrahimov. *İclas çox canlı keçdi.* H.Seyidbəyli. // Canlılıq, həyat, maraq ifadə edən; ifadəli. *Canlı gözlər. Canlı baxış. Canlı sifət.*

5. *məc.* Güclü, parlaq. *Canlı üslub. Canlı boyalar. Canlı təxəyyül. –* [Cəmaləddin:] *Ailəsi xüsusunda söyləyəcəyim sözlər* [Mirzə Rzanın] *mətanət və sədaqətinə bir canlı sübut olacaqdır.* C.Cabbarlı. *Kənd həyatında, təbiətin o zəngin və geniş qucağında nə qədər canlı lövhələr, unudulmaz xatirələr vardır!* A.Şaiq. *Usta bu fikri bir çox canlı misallarla uşaqların beyninə yeridirdi.* Ə.Sadıq.

6. Diribaş, hərəkətli, çevik, qıvraq. *Canlı uşaq.*

◊ **Canlı çiçək** – təzə dərilmiş təbii çiçək. [Sevda:] *Ah, harda o dilbər kələbəklər; Burdan süzülən canlı çiçəklər.* H.Cavid. **Canlı dil** – 1) kitab dilindən fərqli olaraq xalqın danışdığı dil. *Səmədin .. ədəbi dili təşbehlər, idiomlarla dolu canlı xalq dilidir.* O.Sarıvəlli; 2) bir xalqın ünsiyyət vasitəsi olan dil. *Canlı Şərq dilləri.* **Canlı əlaqə** – 1) insanların özləri tərəfindən həyata keçirilən əlaqə. *Telefon vasitəsilə əlaqədən başqa, canlı əlaqə də lazımdır;* 2) sıx, daimi, bilavasitə. *Canlı əlaqəni davam etdirmək. Məktəblə canlı əlaqə yaratmaq.* **Canlı inventar** – işlək və südlük mal-qara. **Canlı qüvvə** – adamlar və heyvanlar (mexaniki qüvvə, texnika qarşılığı olaraq). **Canlı söz** – yeni, maraqlı fikir ifadə edən və dinləyiciyə nüfuz edən danışıq haqqında. *Adamlara canlı söz demək lazımdır.* **Canlı tarix** – tarixi, keçmişi hadisələri, real varlığı əyani surətdə əks etdirən şey haqqında.

**CANLICA** *sif.* Çox canlı, çox güclü, qüvvətli, cəsamətli. *Canlıcadır, zorbacadır baldırım; Sındıra bilməz məni heç ildırım.* M.Ə.Sabir.

**CANLI-CANSIZ** *top.* Həm canlılar, həm cansızlar, hamısı. *Gecələr canlı-cansız uyurkən dərin-dərin; Fəqət sən mənim kimi uyumazsan doyunca.* M.Müşfiq.

**CANLIQ** *is.* İsti alt paltarı; candonu. [Çimnaz] *..pambıqlı canlığını əyninə taxdı, qızına da təzə paltarını dəyişməyi təklif elədi.* Ə.Əbülhəsən. [Əsgərlərin] *əyinlərinə görə olmasa da, qışda onların isti papağı, yun canlığı, yaxşı ayaqqabıları vardı.* Mir Cəlal.

**CANLILIQ** *is.* 1. Canlı şeyin halı. [Arvadın] *gözlərində, üzündə, bütün hərəkətlərində qeyri-adi bir canlılıq vardı..* M.İbrahimov.

2. Təsir, qüvvə. *Hisslərin canlılığı. İlk təəssüratın canlılığı.* // Aydınlıq, parlaqlıq, barizlik. *Canlılıq və həyatilik etibarilə Səməd Vurğunun obrazları xüsusi bir qüvvəyə malikdir.* Mir Cəlal. // *məc.* Həyat, dirçəliş, şənlik, şən əhvali-ruhiyyə. *Züleyxa.. kitabxanaya nə isə qeyri-adi bir canlılıq və həyat gətirmişdi.* M.İbrahimov.

**CANSAĞLIĞI** *is.* Bədənin bütün üzvlərinin normal vəziyyətdə olması, səhhət. *Dedim: – Bunların hamısı ötüşər, insana cansağlığı lazımdır..* Ə.Haqverdiyev. [Gülşən də] *başqa gənclər kimi Bakıya getmək, Azərbaycan Tibb İnstitutunda oxumaq, sonra həkim olub.. adamların ürəyini dinləmək, onların cansağlığını qorumaq.. niyyətində idi.* Ə.Vəliyev.

**CANSIXAN, CANSIXICI** *sif.* və *zərf* Darıxdırıcı, usandırıcı, bezikdirici, üzücü, çox maraqsız, təngəgətirən. *Cansıxan yerlər. Cansıxıcı suallar. – Nagəhan qopan fırtınadan sonra şəhərə əsrarəngiz, qərib, bir az da cansıxan, dərin bir ölüm sükutu çökmüşdü.* M.Hüseyn. *Payız aylarına məxsus cansıxıcı bir ağırlıq qəsəbəni bürüyürdü.* H.Nəzərli. *Elə bil* [Şahmarı] *bütün aləmdən ayırıb, hara isə, cansıxan bir guşəyə atmışdılar.* B.Bayramov.

**CANSIXICILIQ** *is.* Ürəksıxıcılıq, darıxdırıcılıq, bezikdiricilik, usandırıcılıq, maraqsızlıq. *Xalqımıza xas olan xoş bir yumor, hikmətli ifadələr.. Ü.Hacıbəyovun komediyalarını hər cür ağırlıq və cansıxıcılıqdan qurtarmışdır.* Ə.Sultanlı. *Salondakı cansıxıcılıq dözülməz idi.* M.Süleymanov.

**CANSIZ** *sif.* 1. Canlılar aləminə mənsub olmayan, canı olmayan. *Cansız təbiət. Cansız materiya.* // Həyat əlaməti olmayan, ölü, ruhsuz. *Cansız bədən.*

2. Ölgün, tabsız, gücsüz, taqətsiz, zəif. *Gülsüm öz yerində belə möhkəm oturmuşdu ki, deyəsən, cansız bir şeydir.* C.Məmmədquluzadə. [Hacı Mehdi:] *And olsun Allaha, vuraram, zəif, cansız canın çıxar.* Ə.Haqverdiyev. // Arıq, sısqa, cılız. *Emma cansız, arıq, nazik, lətif bir alman qadını idi..* E.Sultanov. *İmran kişi üzdən arıq və cansız görünən, ucaboy, şaxdayanan, düzqamətli bir kişi idi.* M.Hüseyn.

**CANSIZ-ÇƏLİMSİZ** *sif.* Çox cansız, çox zəif, cılız, üzgün. *Cansız-çəlimsiz uşaq. – Klavdiya birinci dəfə gördüyü cansız-çəlimsiz, ortaboylu, sallaqbığlı bu adama diqqətlə nəzər yetirdi.* Ə.Abasov.

**CANSIZLAŞMA** "Cansızlaşmaq"dan *f.is.*

**CANSIZLAŞMAQ** *f.* Zəifləmək, arıqlamaq, cılızlaşmaq, üzülüb getmək. *Uşaq lap cansızlaşıb.*

**CANSIZLIQ** *is.* Zəiflik, arıqlıq, sısqalıq, üzgünlük. *Cansızlığından yeriyə bilmir.*

**CANSÜRTƏN** *is.* Hamamda kisəçəkən; kisəçi. *Vaqif Tiflisin vəziyyətini əvvəlcə hamamda cansürtən Ocaqquludan öyrəndi.* Çəmənzəminli.

**CANTƏZƏLƏYƏN** *sif.* Xoş, ürəyəyatan, ürəkaçan, canfəza. *Getdikcə bir-birindən gözəl, bir-birindən füsunkar, cantəzələyən, ürəkaçan mənzərələr görürük.* M.İbrahimov.

**CANTIRAQ** *sif. dan.* Canlı, cüssəli, çəlimli. *Cantıraq oğlan. – Cantıraq, cəld bir adam əlində kağız yazır, yazdığını da təkrar edirdi.* Mir Cəlal.

**CANVERİCİ** *sif.* Həyat bəxş edən, canlandıran, həyatverici, dirildən. *Canverici baxış. – Canverici ləbindədir şərbəti xəstə könlümün; Kimdir irişdirən anı ləli-ləbin şəfasına.* Nəsimi.

**CANVERMƏ** *is.* Can üstə olma, cançəkişmə, ölüm halında olma.

**CANYANDIRAN** *sif.* Tapşırılan və ya öhdəsində olan işi, vəzifəni səylə, ürəklə

yerinə yetirən, işə səy göstərən; səyli, çalışqan. [Məhərrəm bəy:] *..İmran kimi işləyən, canyandıran köməkçin var.* S.S.Axundov. *Ustaya elə gəlirdi ki, hara köçsə, belə hörmətcil, canyandıran adamlar görə bilməyəcək.* M.Süleymanov.

**CANYANDIRANLIQ** *is.* 1. Cəhd, qeyrət, hümmət, səy.

2. Qeydkeşlik, himayə, diqqət, şəfqət, canıyananlıq, qayğıkeşlik. *Canyandıranlıq eləmək. Canyandıranlıq göstərmək.*

**CANYANDIRMA** *is.* Həddindən artıq birinin və ya bir işin qayğısına qalma, ürək yandırma, həddən artıq qeyrət və səy göstərmə, çalışma. [Fatmanisə:] *Nə qədər dedim: – A kişi, getmə, dedi: – Olmaz! Bu da canyandırmanın axırı.* Ə.Haqverdiyev.

**CAR¹: car çəkmək (çağırmaq)** – 1) *köhn.* Yüksək səslə camaata bir şeyi xəbər vermək, elan etmək, bildirmək. [Mozalan bəy:] *Gördüm, bir hambal car çağırır ki, üç gündür Hacı Seyid Ağanın qızılquşu qaçıbdır.* Ə.Haqverdiyev. [Şeyx Haşimi nişançılara:] *Tez olun, car çəkin! Car çəkin, bütün bazar əhli bura yığılsın!* Ə.Məmmədxanlı; 2) *məc.* Aləmə yaymaq, hamıya bildirmək, xəbər vermək, hamıya eşitdirmək (xəbəri, bir sözü və s.-ni); // Məc. mənada. *Car çəkir çarxların çaxnaşıq səsi; Car çəkir, qışqırır nəhəng motorlar...* S.Vurğun. *Ellərə car çəkən payızın səsi; Düzlərdə sərt əsən küləklərdədir.* N.Xəzri. *Qəzəb Səltənəti xoruzlar car çəkib banlaşıncaya qədər yatmağa qoymamışdı.* B.Bayramov.

**CAR²** b a x **cari** 1-ci mənada. ◻ **Car olmaq** – cərəyan etmək, axmaq, tökülmək. *Hanı bu yaylaqda yaylayan ellər? Görəndə gözündən car oldu sellər.* Aşıq Ələsgər.

**CARÇI** *is.* 1. *köhn.* Car çəkən, uca səslə bir xəbəri və s. camaata elan edən, bildirən. [Koroğlu] *elə təzəcə bazara girmişdi, bir də gördü, carçılar car çəkirlər.* "Koroğlu". *..Carçılar ortada gəzib, müxtəlif xəbərlər verirdilər.* S.Rəhman.

2. *məc. tənt.* Müjdəçi, bir şeyin ilk xəbərçisi. *Azərbaycan torpağı və Azərbaycan xalqının böyük iftixarı olan Nizami bütün dünyada humanizmi tərənnüm edən intibah dövrünün ilk carçısı idi.* M.İbrahimov. *Sülh carçısıyıq biz, uzun illər bilir aləm; Məşhur Azərbaycan alimi M.F.Axundzadə İran inqilabının ilk carçısı olmuşdur.* P.Makulu.

**CARİ** *sif.* [*ər.*] 1. *klas.* Cərəyan edən, axan, axıcı. ◻ **Cari etmək** – axıtmaq. *Gülab vurma üzə, etmə göz yaşın cari; Gözüm çıxar, o gül üstündə şəbnəm istəmərəm.* S.Ə.Şirvani. *Gözümdə cari edib əşki həm rəvan getmə!* X.Natəvan. **Cari olmaq** – 1) axmaq, tökülmək. *Mirzə Nəsib, Xəlilin anasının danışığını o biri otaqda eşidirdi, qoca Mirzəyə övrətin sözləri o qədər təsir etdi ki, gözündən biixtiyar yaş cari oldu.* Ə.Haqverdiyev; 2) məc. mənada. *Məktəbdə var şərafət; Dəftərdə var lətafət; Cari olur qələmdən; Şirin-şirin hekayət.* M.Ə.Sabir.

2. Keçməkdə olan, hal-hazırkı, indiki, indi baş verən, cərəyan edən. *Cari dərs ili. Cari ildə – İclası hərbi şuranın sədri Səttarxan açdı və qısa olaraq cari vəziyyət və gələcək vəzifələr haqqında danışmaq üçün Əli Səhlanlıya söz verdi.* P.Makulu.

◊ **Cari etmək (eləmək)** *klas.* – müəyyən üsul və ya qayda ilə icra etmək, yerinə yetirmək, rəsmi şəklə salmaq. [Şah:] *Sonra üzün Molla Rəsula tutub buyurdu ki: – Bunların siğeyi-talaqlarını cari eylə!* M.F.Axundzadə. [Şeyx Nəsrullah Şeyx Əhmədə:] *Şeyx Əhməd, mənim tərəfimdən vəkil ol və siğəni cari elə.* C.Məmmədquluzadə. **Cari olmaq** – icra olunmaq, rəsmi şəklə salınmaq, qanuniləşmək. [Mirzə Əhməd ağa:] *..Qızının nikahının Fərmana cari olmasına riza verirsənmi?* Ə.Haqverdiyev.

**CARİYƏ** *is.* [*ər.*] Keçmiş zamanlarda özgə ölkələrdən zorla qaçırılaraq azadlıqdan məhrum edilən, pulla alınıb-satıla bilən, hər cəhətdən sahibinin arzularına tabe olan qız və ya qadın. *Hökmdar saraylarının cariyələri olmasaydı, hökmdarlar bir gün də olsun öz mələkələri ilə yaşaya bilməzdilər.* M.S.Ordubadi. // Ümumiyyətlə qulluqçu, xidmətçi qız. *Bu sırada Sevda cariyələri ilə bərabər gəlir.* H.Cavid. [Şair qasidə:] *Bu qızı isə qaytarıb geri aparın, mənə kəniz və ya cariyə lazım deyil!* Ə.Məmmədxanlı. *Cariyələr, nökərlər düşdülər əl-ayağa; Hərəsi bir tərəfdən qulluq etdi qonağa.* B.Vahabzadə.

**CARLAMA** "Carlamaq"dan *f.is.*

**CARLAMAQ** *f.* Car çəkmək, uca səslə camaata elan etmək, bildirmək. *Uzaqdan çavuş carlayır, camaat salavat çəkir.* C.Məmmədquluzadə.

**CASUS** *is.* [*ər.*] 1. Məxfi materialları gizli surətdə öyrənib başqalarına çatdıran şəxs. *Fəhlələr, Şendrikov qardaşlarının casus olduqlarını söyləyəndə bəzi yoldaşlar buna şübhə ilə baxırdılar.* M.Hüseyn. [Bağırxan:] *O gedərkən tapşırdı ki, burada ehtiyatlı dolanaq. Arandan gələn hər yad adamı dövlət casusu hesab edək.* P.Makulu. // *dan.* Birini addım-addım izləyən, hər hərəkətinə göz qoyan, pusan adam haqqında. [Sona:] *Casusların ən başçısını tanıdım.* H.Nəzərli. *Yasavulbaşı bu köhnə casusu* [topalı] *görən kimi canına lərzə düşdü.* M.Rzaquluzadə.

2. *məc.* Xəbərçi, şeytançılıqla məşğul olan. *Məşədinin dostu bir parça ağ kağızda karandaşla casus adlandırdığı tələbənin karikaturasını çəkib, onun altında "casus!" sözünü yazdı..* M.Hüseyn.

**CASUSLUQ** *is.* Dövlət sirri olan məlumatı, materialları və s.-ni başqa dövlətə vermək üçün gizli surətdə toplamaqdan ibarət cinayətkar fəaliyyət. *Casusluq etmək. – Göyçək.. casusluq xidmətinə görə çox yaxşı təltif ediləcəyinə qəti inanırdı.* Ə.Əbülhəsən.

**CAVAB** *is.* [*ər.*] 1. Şifahi və ya yazılı suala, sorğuya və s.-yə qarşılıq olaraq söylənən söz (*sual, sorğu* müqabili). *Cavab tapmaq. Cavabı ölçüb-biçmək. Bu cavab olmadı. – Nə üçün trest geridə qalır? Sual qısa və aydın olduğu üçün cavab da eyni dərəcədə qısa və aydın olmalı idi.* M.Hüseyn. // Yazılan məktuba, müraciətə və s. cavab olan məktub. *..Məktubun cavabını aldım. Ərizənin cavabı hələ də yoxdur. – Bahadır kağızına cavab gözləyirdi.* N.Nərimanov. // Keçilmiş dərsin və ya verilmiş sualın müəllimə izah edilməsi; verilmiş suala dair materialın xülasə edilməsi. *Cavablar imtahan komissiyasını qane etdi. Cavablara diqqətlə qulaq asmaq. – ..Ancaq verdiyim izahedici suallara Ağarəhim çox qəşəng cavablar verdi.* S.Rəhman. ◻ **Cavab vermək** – 1) sorğuya qarşılıq olaraq söz demək. *Məmməd səbirli tərpəndi, sakit və soyuqqanlı cavab verdi.* V.Şıxlı; 2) məsuliyyət daşımaq, cavabdeh olmaq. [Nüsrət:] *Hər şey üçün mən özüm cavab verəcəyəm.* C.Cabbarlı. [Zahid oğlu:] *Qoy indi Fərhad oğlu öz ağ başı ilə ədalət məhkəməsi qarşısında cavab versin!* S.Rəhimov. // Çağırışa hay vermə, səsə səs vermə. *Cavab əvəzinə yenə də eyni sükut…* H.Nəzərli.

2. Riyazi misal və məsələnin həlli, nəticəsi. *Məsələnin düzgün cavabını almaq. Misala cavab yazmaq.*

**CAVABDEH** *sif.* və *zərf* [*ər.* cavab və *fars.* …deh] Bir iş üçün məsuliyyət daşıyan, cavab verməli olan, üzərinə məsuliyyət düşən, məsuliyyətli, məsul. *Hər kəs öz işinə, öz sözünə cavabdehdir.* – [Rüstəmbəy:] *Nağı bəy ölər, cavabdeh biz olarıq.* S.S.Axundov. [Şiraslan:] *İndi mən gərək dövlət kontrolu qarşısında cavabdeh olam.* M.Süleymanov.

**CAVABDEHLİK** *is.* Öz hərəkət və işləri üçün cavab vermə, onların nəticələri üçün məsuliyyəti öz üzərinə götürmə; məsuliyyət. [Səkinə Mayaya:] *Sən kişiyə qulaq asma, işin çoxdur, ağır işdir, cavabdehliyi böyükdür.* M.İbrahimov. *Təmirin bütün cavabdehliyi Ümidin üzərində idi.* B.Bayramov.

**CAVABDƏHƏNDƏ** [*ər.* cəvab və *fars.* …dəhəndə] B a x **cavabdeh**.

**CAVABDƏHƏNDƏLİK** b a x **cavabdehlik**.

**CAVABƏN** *zərf* [*ər.*] Cavab olaraq, cavabında. *Suala cavabən bunları dedi… – Şükүfələnmiş güllər nəsimin dəyməsindən enib-qalxdıqca Gülsümün vidasına cavabən "get, Allah səni xoşbəxt eləsin!" – deyirdilər.* Ə.Haqverdiyev.

**CAVABLI** *sif.* Cavabı olan, cavabı verilən. *Cavablı sual. Cavablı teleqram.*

**CAVABSIZ** *sif.* və *zərf* Cavabı olmayan, cavabı verilməyən. *Cavabsız məktub. Cavabsız suallar. Bir dənə ərizə cavabsız qalmamalıdır.* // Məc. mənada. *Ellər talan olur, vergilər ağır; Göylər cavabsızdır, buludlar sağır.* S.Vurğun. *Cavabsız eşqinin təlatümündə; Aylar, illər boyu aşıb-daşdı o.* B.Vahabzadə. ◻ **Cavabsız buraxmaq (qoymaq)** – cavab verməmək. *Sualı cavabsız qoymaq. – Lalə də, fəhlələr də* [Qüdrəti] *cavabsız buraxdılar.* M.Hüseyn.

**CAVAHİR** *is.* [*ər.*] Qiymətli daş (almaz, yaqut və s.). [Səkinə xanım:] *Ağa Həsən istəyir məni başdan-ayağa cavahirə də tuta,*

*mən ona gedən deyiləm.* M.F.Axundzadə. // Cavahirdən qayrılmış, düzəldilmiş. *Cavahir qolbaq.*

**CAVAHİRAT** *is.* [*ər.* "cəvahir" söz. cəmi] Qiymətli daşlar, daş-qaş. *Cavahirat taxmaq. Cavahirat mağazası.* – [Odabaşı:] *Hacı Kamyabın evində də cavahirat az deyildi.* Ə.Haqverdiyev.

**CAVAHİRATÇI** *is.* Cavahirat satan, cavahirat alverçisi, cavahirat taciri. // Cavahiratdan (qiymətli daşlardan) bəzək şeyləri qayıran usta, zərgər.

**CAVAHİRATÇILIQ** *is.* Cavahiratçının işi, sənəti; cavahirat işi ilə məşğul olma.

**CAVAHİRÇİ** b a x **cavahiratçı**.

**CAVAHİRFÜRUŞ** [*ər.* cəvahir və *fars.* füruş.] *köhn.* B a x **cavahirsatan**. [Osman] *diksinib başını döndərdikdə cavahirfüruşun xanımı Lidanı gördü.* Çəmənzəminli. *Bir yandan cavahirfüruşlar, bir tərəfdən zərgərlər nazənin gözəllərə ziynət və yaraşıq əsbabı mühəyya edirlərmiş.* F.Köçərli.

**CAVAHİRLİ** *sif.* Cavahirlə, qiymətli daş-qaşla bəzədilmiş. *Cavahirli kəmər. – Odur "ədalət zəncirini" boynundan asaraq, bəzəkli və cavahirli qılınca söykənmiş vəliəhd böyük həyətdəki çarhovuzun yanında dayanmışdır.* P.Makulu.

**CAVAHİRSATAN** *is.* Qiymətli daş-qaş satan tacir, daş-qaş alverçisi.

**CAVAN** [*fars.*] 1. B a x **gənc** 1-ci mənada. *Cavan müğənni. Cavan oğlan. Cavan müəllim. – Rövşən Rüstəm kimi igid, yeniyetmə, cavan bir oğlan idi.* "Koroğlu". *Bu cavan oğlan raykom katibi Qoşqar Sadıqzadə idi.* İ.Hüseynov. // İs. mənasında. *Cavanlar və qocalar.* – [Məşədi İbad:] *A kişi, vallah, mən nə qədər qoca olsam da, min bığıburma cavana dəyərəm.* Ü.Hacıbəyov. *Şofer qaragöz, qaraqaş, qırmızı, girdəsifət, sağlam bir cavan idi.* S.Vəliyev.

2. *sif.* Təzə əkilmiş, təzəcə salınmış. *Cavan ağac. Cavan bağ* (*meşə*).

3. Yeni meydana çıxmış. *Elmin cavan sahəsi.*

**CAVANCA** *sif.* Cavan, lap cavan. *Cavanca bir oğlan içəri girdi.*

**CAVANCASINA** *zərf* Cavan (gənc) kimi, cavana (gəncə) yaraşan tərzdə. *Cavancasına hərəkət etmək.*

**CAVANƏZƏN** *is.* [*fars.*] Cavan qadın. *Əlbəttə, əlbəttə, həyanın özü cavanəzən üçün böyük gözəllikdir.* N.Vəzirov. [Telli:] *Bütün kənddə heç bir cavanəzənin elə zərif xalçaları yoxdur.* S.Hüseyn.

**CAVANLANMA** "Cavanlanmaq"dan *f.is.*

**CAVANLANMAQ** b a x **cavanlaşmaq**.

**CAVANLAŞDIRMA** "Cavanlaşdırmaq"-dan *f.is.*

**CAVANLAŞDIRMAQ** *f.* 1. Daha cavan göstərmək. *Bu paltar onu lap cavanlaşdırır.*

2. *məc.* Gümrahlaşdırmaq, güc, qüvvət, enerji vermək. *Narzan vannaları adamı lap cavanlaşdırır. Dağ havası qocaları da cavanlaşdırır.*

**CAVANLAŞMA** "Cavanlaşmaq"dan *f.is.*

**CAVANLAŞMAQ** *f.* 1. Gündən-günə yaxşılaşmaq, cavan görünmək; özünü cavan kimi qıvraq hiss etmək; gəncləşmək. *"Ay ellər!" deyirəm ürəyimdə mən; Ömür cavanlaşır ellər deməkdən.* S.Vurğun. *Oğul anasına diqqətlə nəzər saldı: – Bir mənə yaxşı-yaxşı bax, görüm, cavanlaşmısan, ya yox?* M.Hüseyn.

2. *məc.* Özünü gümrah, sağlam, cavan hiss etmək. *İdman məşğələlərindən sonra xeyli cavanlaşmışam.*

**CAVANLIQ** *is.* Cavan yaşlar, gənclik dövrü, gənclik (*qocalıq* ziddi). *Əfsus, qocaldım, ağacım düşdü əlimdən; Səd heyf cavanlıq!* M.Ə.Sabir. *Bir az sükutdan sonra Yusif dedi: – Cavanlıqdır, zərər yoxdur.* N.Nərimanov. // **Cavanlıqda** – gənc yaşlarında, gənclikdə, cavan vaxtlarında. *Cavanlıqdan qocalığa güc saxla.* (Ata. sözü). *Deyirlər ki, cavanlıqda Mirzə Səfər özü şairlik fikrinə düşüb şeir demək üçün çox çalışmışdı, lakin bir nəticə hasil olmamışdı.* Ə.Haqverdiyev.

**CAVANLI-QOCALI** *sif.* Həm cavanlar, həm qocalar, hamılıqla. *Cavanlı-qocalı töküllüşüb gəldilər. Cavanlı-qocalı hamı da bunlara qoşulmuşdu.*

**CAVANMƏRD** [*fars.*] b a x **comərd**.

**CAVANMƏRDLİK** b a x **comərdlik**.

**CAVANYANA** *sif.* Cavana yaraşan, cavana münasib olan. *Cavanyana geyinmək.*

**CAVİD** *sif.* və *zərf* [*fars.*] *klas.* Əbədi, daimi, həmişəyaşar, ölməz. *Meydir ləbi, əmma bu meyin nəşəsi cavid; Güldür üzü, əmma bu*

*gülün var bəqası.* Q.Təbrizi. *Dünyada varsa dövləti-cavid, o eşqdir; Olmaz sevib-sevilməyən ömründə bəxtiyar.* H.Cavid.

**CAVİDAN** [*fars.*] *klas.* B a x **cavid**.

**CAVİDANİ** b a x **cavid**. *Şairim! Qəm yemə, alami-cəhan, fanidir; Cavidani yaşayış ləzzəti-rühanidir.* M.Hadi.

**CAYDAQ** *sif. dan.* Uzun, arıq, uzundraz. *Caydaq adam. Caydaq oğlan.* – [Tahir] *hələlik – deyə, gülə-gülə uzun, caydaq qıza əl elədi və sürətlə uzaqlaşdı.* M.Hüseyn. *Kələntərlini yaxından tanıyanlar.. bilirdilər ki, bu hacıleylək kimi caydaq kişi pencəyi əynindən qoysa, dərhal adamlıqdan çıxar.* İ.Hüseynov.

**CAYNAQ** *is.* 1. Bir çox heyvan və quşların barmaqlarının qarmaqvari iti ucları. *Qartal caynağı.* – [Tağı:] *Qaraquş da yerdə dovşanın qaçdığını, ya kəkliyin uçmağını gördükdə, ildırım kimi şığıyıb caynağına alacaqdır.* S.S.Axundov. [Yusif Şahmara:] *Yeməli quşların – qırqovulun, kəkliyin, turacın caynağı üç olur.* B.Bayramov. *Kamal elə bir həyəcanla çığırdı ki, elə bil qaraquş indicə caynaqları ilə onun üz-gözünü dırmalayacaqdı.* M.Rzaquluzadə.

2. *məc.* Çəng. *Caynağına keçmək.* – [Bədəl:] *Cəmaətimiz xan caynağından qurtarıb, öz əlinin əməyini rahət yeyib yaşayır.* Ə.Haqverdiyev. [Səlbinaz xanım anasına:] *..Məni nədən ötrü bu kaftarın caynağına vermisən...* N.Vəzirov.

**CAYNAQLAMA** "Caynaqlamaq"dan *f.is.*

**CAYNAQLAMAQ** *f.* Caynağı ilə tutmaq, caynağı ilə tutub götürmək.

**CAYNAQLAŞMA** "Caynaqlaşmaq"dan *f.is.*

**CAYNAQLAŞMAQ** *qarş.* Bir-birini caynaqla didmək, caynaqlarını işə salaraq birbirilə döyüşmək.

**CAYNAQLI** *sif.* Caynağı olan. *Bu meşədə caynaqlı bir şir şahlıq eləyirdi.* S.Rəhimov. [Xan:] *Gördüm ki, qapqaranlıq göylərdən qara qanadlı, qara caynaqlı əjdahalar başımın üzərində hərlənir, qızıl şahinimi qapıb aparırlar..* M.Rzaquluzadə.

**CAZ** *is.* [*ing.*] 1. Əsas hissəsi nəfəsli və zərbli alətlərdən ibarət olan orkestr. *Meri səhnədədir, Meri oxuyur; Qulaqlar tutulur cazın səsindən.* N.Xəzri. *Caz orkestri durmadan çalır, rəqqasələr .. oynayırlar.* S.Vəliyev.

2. Belə orkestrdə çalınmaq üçün yazılmış əyləncəli, əsasən rəqs musiqisi.

**CAZİBƏ** *is.* [*ər.*] 1. Cisimlərin bir-birini özünə cəzb etməsi xassəsindən ibarət fiziki hadisə. *Eynşteynin cazibə nəzəriyyəsi. Cazibə qüvvəsi məlum qarşılıqlı təsir qüvvələrindən ən zəifidir.*

2. *məc.* İnsanın könlünü cəzb edən xassə, cəzbedici qüvvə, lətafət. [Əzra Zəhraya:] *Səndə bir öylə hüsnü cazibə var; Ki, olur hər görən pərəstişkar.* H.Cavid. [Xavər] *gözəlləşmiş, yanaqlarında bir qızartı və cazibə əmələ gəlmişdi.* M.İbrahimov. *..Qızın sifətindəki mərdanə gözəllik, ..sərrastlığı, danışığındakı cazibə* [Səlimin] *gözündən qaçmamışdı.* B.Bayramov.

**CAZİBƏDAR** [*fars.*] b a x **cazibəli**. *Cazibədar gözəllik. Cazibədar mənzərə. – On doqquz-iyirmi yaşlarında olan* [Südabə] *cazibədar bir gözəlliyə malik idi.* M.İbrahimov. [Sona] *bahar axşamı kimi təzə, ətirli və cazibədar idi.* Ə.Əbülhəsən. [Sonanın] *cazibədar mavi gözləri irilənib daha da gözəlləşdi...* B.Bayramov.

**CAZİBƏDARLIQ** *is.* Cazibəlilik, cəzbedicilik, cazibə qüvvəsinə malik olma; lətafət. *Gülgəz bütün gözəlliyi və cazibədarlığı ilə* [Səmədin] *qarşısında dayanıb, sehirlənmiş kimi yerindən tərpənə bilmirdi.* Çəmənzəminli. *Olduqca cazibəli və nəzakətli qız öz işilə məşğul idi.* S.Rəhimov. // Lətafətli, məlahətli. [Həsən:] *Amma nə cazibəli səsi var?* H.Nəzərli.

**CAZİBƏLİLİK** *is.* Cazibə qüvvəsi; insanın könlünü cəzb etmə xassəsi; cazibə, lətafət.

**CE** "C" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**CECƏ** *is.* 1. Bəzi yağlı bitkilərin yağını sıxıb çıxardıqdan sonra qalan toxumu, qalıqları. *Çiyid cecəsi. Qarğıdalı cecəsi. – Zeytun meyvələrinin yağı çıxarıldıqdan sonra yerdə qalan cecə* (*jmıx*) *heyvanların yemlənməsi üçün işlədilir.* İ.Axundzadə.

2. Meyvənin yeyilməyən iç hissəsi, toxumlu hissəsi, puçal. *Heyva cecəsi. – Şiz* [çocuğu] *itələyərək əlinə bir alma cecəsi verdi.* Çəmənzəminli.

**CECƏDOĞRAYAN** *is. xüs.* Cecə doğrayan alət, maşın. // Sif. mənasında. *Cecədoğrayan maşın. Cecələri cecədoğrayan maşın xırdalayır.*

**CECİM** *is.* Arasına yorğan-döşək və s. yığmaq, döşəməyə salmaq, ya da xalça kimi divardan asmaq üçün müxtəlif rəngli iplərdən toxunan zolaqlı, yaxud naxışlı döşənəcək. *Xalı, xalça, cecim və ipəklə bəzənmiş bu otaq Şuşa sövdəgəri Hacı Kərimin qızı Anaxanım üçün ayrılmışdı.* Çəmənzəminli. *Rəhim bəylə ikimiz bir kənarda, otun üzərinə salınmış cecim üstündə əyləşib, söhbətə məşğul olduq.* Ə.Haqverdiyev. *Arabanın içinə quru ot töküb, üstündən bir cecim saldılar.* T.Ş.Simurq.

**CEHİZ** *is.* Ərə gedərkən ata evindən qıza verilən əşyalardan ibarət hədiyyə. [Telli:] *Məni yandıran cəhət burasıdır ki, İslam ikinci arvadını mənim cehizimlə aldı.* S.Hüseyn. *Gəlinlər, qızlar nişanlının cehizini həyətin ortasında duran ikitəkərli arabaya yükləyirdilər.* M.Hüseyn.

**CEHİZLİ** *sif.* Cehizi olan, özü ilə cehiz aparan (gətirən). *Cehizli gəlin.*

**CEHİZLİK** *is.* Cehiz kimi ayrılmış, cehiz olaraq verilmiş. *Cehizlik xalı. Cehizlik qablar. – Rəhmətlik qoca nənənin cehizlik qızılları torksinə doğru axır.* Çəmənzəminli. [Rza:] [Anam] *qat kəsmiş cehizlik boğçasını açdı..* M.İbrahimov.

**CEHİZSİZ** *sif.* Cehizi olmayan. Cehizsiz gəlin. *Toy cehizsiz, gəlin yengəsiz olmaz.* (Ata. sözü). *– Göydə ulduzlar; Şaxtalı buzlar: Cehizsiz qızlar; Bu balama qurban.* (Layla).

**CEM** *is.* [*ing.* jam – mürəbbə] Meyvə və giləmeyvədən hazırlanan qatı mürəbbə. *Alma cemi. Qaysı cemi. Pasterizə edilmiş cem.*

**CEMPER** *is.* [*ing.*] Yaxalıqsız toxunma kofta, fufayka. *Qırmızı cemper.*

**CENTLMEN** *is.* [*ing.*] 1. Aristokrat cəmiyyətinin qayda-qanunlarına və əxlaq normalarına ciddi riayət edən adam.

2. Öz ciddi, qəşəng geyimi, incə davranışı ilə fərqlənən nəzakətli, tərbiyəli adam haqqında. *Burada mən dayandım və kənarda oturan və bizim danışığımıza qulaq verən centlmenə qulaq verəndən sonra bir azca şübhələnməyə başladım..* C.Məmmədquluzadə.

**CEYRAN** *is.* Antilop cinsindən irigözlü, incəayaqlı, sürətlə qaçan zərif heyvan. *Ceyranın qaçmağın elə gördüm, ətindən zəhləm getdi.* (Məsəl). *Ceyran çox iti qaçan və həssas heyvandır.* İ.Əfəndiyev. *Bahadur ceyrana baxdı, ceyranın gözləri ona həqiqətən kiminsə gözlərini xatırlatdı.* S.Rəhman. // Təşbehlərdə gözələ işarə.

◊ **Ceyran belinə çıxmaq** – qıt olmaq, tapılmamaq, çox çətin tapılmaq. [Xalıqverdinin] *..ailəsini və dostlarını dardan qurtarmaq üçün taxıl gərək idi. Taxıl isə, necə deyərlər, ceyranın belinə çıxmışdı.* Ə.Vəliyev.

**CEYRANBAXIŞLI** bax **ceyrangöz(lü)**. *Ceyranbaxışlı dilbər, durnagözlü nazənin; Ömründə görməmişdir nə göz yaşı, nə ənin.* N.Rəfibəyli.

**CEYRANBASAN** *sif.* İti qaçan. *Ceyranbasan at. – Bu ayqır Beyrəkin ceyranbasan boz atı idi.* M.Rzaquluzadə.

**CEYRANGÖZ(LÜ)** *sif.* İri, qəşəng gözləri olan. *Göllərində ördəkləri üzərlər; Çöllərində maralları gəzərlər; Güllərindən gəlinlər tac bəzərlər; Ceyrangözlü qızları var ölkəmin.* C.Cabbarlı. *Sən ceyrangözlüsən, çatmaqaşlısan; Tayın-tuşun çoxdur, yar-yoldaşlısan..* N.Rəfibəyli.

**CEYRANI** *is. mus.* Azərbaycan xalq oyun havalarından birinin adı. "Ceyranı" rəqsini adətən qadınlar ifa edir. – [Gülyaz] *..ordlarını şişirdib zurnada "Ceyranı" havası çalan çalğıçıların qarşısında məharətlə oynayırdı.* M.Hüseyn.

**CEYRANKEÇMƏZ** *sif.* Çox dar, keçilməsi çətin. *Ceyrankeçməz yol.*

**CEYRANOTU** *is. bot.* Bəzi növlərinin üstü xovlu tükcüklərlə örtülü uzun qılçıqlı ot – bitki.

**CƏBƏL** *is. məh.* Dağ, çətin qalxılan yer.

**CƏBBƏXANA** *is.* [*ər.* cəbhə və *fars.* ...xanə] Silah və hərbi sursat saxlanan yer, anbar; arsenal. [Fəxrəddin] *əlini çənəsinin altına söykəyib cəbbəxana meydanından gəlib-keçən kişilərə və qadınlara baxırdı.* M.S.Ordubadi. [Səttarxanla Bağırxan] *cəbbəxana tərəfə keçmək istəyirdilər ki, bir çörək dükanının qabağında böyük qələbəlik gördülər.* P.Makulu. // Hərbi sursat, hərbi lə-

vazimat. // *məc.* Böyük ehtiyat mənbəyi. *Ədəbiyyat dilin cəbbəxanasıdır.* M.İbrahimov.

**CƏBHƏ** *is.* [*ər.*] *hərb.* 1. Düşmənlə üz-üzə durub vuruşan ordu hissələrinin yerləşdiyi sahə, xətt. *Cəbhə boyu hücuma keçmək. – Eldar bir ehtiyat komandiri kimi cəbhəyə getməli oldu.* İ.Əfəndiyev. *Qəhrəmanla Eldar cəbhə yoldaşı idilər.* M.Rzaquluzadə. // Hər hansı bir yerdə çox geniş miqyasda aparılan hərbi əməliyyat. *Cəbhə ləğv edilmişdir.* // Müharibə vaxtı ən iri qoşun birləşməsi, qoşun hissəsi. *Cəbhə komandanı. Cəbhə qərargahı.*

2. *məc.* Eyni vaxtda kütləvi surətdə, geniş miqyasda iş aparıla bilən yer, sahə. *Bir cəbhənin adamları. – Hərə öz cəbhəsində; Bir vəzifə daşıyır.* M.Rahim. // Hər hansı bir dövlət və ya siyasi fəaliyyət sahəsi. *İdeoloji cəbhə. Əmək cəbhəsi. – "Əkinçi" nəşr edildiyi gündən son nömrəsinə qədər iki cəbhə, iki ictimai görüş və iki meyil arasında gedən mübarizəni əks etmişdir.* M.İbrahimov. // *məc.* Bir məqsəd, bir amal uğrunda çalışan adamların ən geniş birləşməsi. *Sülh tərəfdarlarının vahid cəbhəsi. Xalq cəbhəsi.*

3. *meteor.* Müxtəlif hava kütlələri arasında bölgü zonaları. *Atmosfer cəbhəsi.*

◊ **Hər iki cəbhədə** – iki istiqamətdə. *Hər iki cəbhədə fəaliyyət göstərmək.*

**CƏBHƏÇİ** *is.* Müharibə vaxtı cəbhədə olan və ya olmuş adam. *Cəbhəçi ailəsi. Cəbhəçilərin bayramı. – Cəbhəçilər həmişə ön atəş xəttində dayanmalıdırlar.* Ə.Vəliyev.

**CƏBR**[1] *is.* [*ər.*] Zor, zor işlətmə, zülm. *Fələkin cəbrindən, el tənəsindən; Dərdim artıb, bir ümmana dönübdü.* Aşıq Ələsgər. [Sönməz:] *Xalq ərəblərin cəbrindən qurtarmaq üçün odlardan kömək istəyir.* C.Cabbarlı. *Əvvəl gündən sevmədim cəbri və belə cəbrli şeyləri xoşlamadım.* R.Rza. ◻ **Cəbr çəkmək** – cəzasını çəkmək. *Zeynal* [Qadir üçün] *cəbrindir çək* (*dedi*).. Ə.Əbülhəsən. **Cəbr etmək (eləmək)** – zor işlətmək, zülm etmək. *Əzizim cəbr eylədi; Yar yara cəbr eylədi. Sağ olsun ürəyim ki; Bir belə səbr eylədi.* (Bayatı). // Zorla məcbur etmək. [Tarverdi:] *Namaz, bura gəl, bilirsənmi, cəbr eləmə, görürsən ki, qorxurlar, dəxi niyə qısnayırsan?* M.F.Axundzadə. **Cəbrə düşmək** – zora düşmək, əziyyət çəkmək. [Muxtar Firəngizə:] *Arvad kişinin yanında olsa, iş də bu qədər artmaz, arvad da bir belə cəbrə düşməz..* B.Bayramov.

**CƏBR**[2] *is.* [*ər.*] Riyaziyyatın, ədədi qiymətlərindən asılı olmayaraq, kəmiyyət üzərində aparılan əməliyyatları öyrənən sahəsi. Cəbrə aid ilkin tədqiqatlar 4 min il əvvəl Babilistanda aparılmışdır.

**CƏBRƏN** *zərf* Zorla, güclə, zor işlədərək, zorla məcbur edərək, məcburiyyət altında. *Cəbrən razı olmaq. Cəbrən qəbul etmək.* – [Pəri Cadu:] *Hər gün, deyəsən, məni cəbrən gətirirlər buraya.* Ə.Haqverdiyev.

**CƏBRİ**[1] *sif.* 1. Zorla icra olunan, zorla edilən, məcburi, zorən. *Hacıyevə nə üçünsə elə gəldi ki, bu gülüş cəbri bir gülüşdür.* Ə.Əbülhəsən.

2. İcbari, məcburiyyət altında. *Beş gün keçdi, məhbuslar azad olundu və arx üstə cəbri iş ilə məşğul olanlar da öz işlərinə qayıtdılar.* B.Talıblı.

**CƏBRİ**[2] *sif. riyaz.* Cəbrə aid olan. *İrrasional cəbri tənlik. Sadə cəbri ədədlər.*

**CƏBRŞÜNAS** *is.* [*ər.* cəbr və *fars.* ...şünas] Cəbr mütəxəssisi.

**CƏDD** *is.* [*ər.*] Ata və ya ananın atası; baba; əcdad. *Həzrəti-Yəqub .. sonra buyurdu ki, .. cəsədimi cəddim İbrahim Xəlil məzarında dəfn edəsiniz.* A.Ə.Axundzadə.

**CƏDD-ƏQRƏBA** *is.* [*ər.*] Bütün nəsil, qohum-əqrəba, ata-baba.

**CƏDİD(Ə)** *sif.* [*ər.*] Yeni, təzə. *Nə mədrəsə, nə müəllim, nə bir üsuli-cədidə; Və nə uşaqlarımızda bu qabiliyyət olaydı!* M.Ə.Sabir.

**CƏDVƏL** *is.* [*ər.*] Qrafalar üzrə müəyyən qaydada yığılmış hər hansı məlumat və ya rəqəmlər siyahısı. *Dərs cədvəli. Oyun cədvəli. – Rüstəm kişi aram ilə trubkasını tüstülədərək, qabağındakı cədvəli gözdən keçirdiyindən, Salman xeyli danışmayıb ona baxdı.* M.İbrahimov. ..[Şahmar] *iki-üç aydan bəri cədvəldə qalan əməkgünlərini kitabçalara köçürürdü.* B.Bayramov.

**CƏDVƏLÇİ** *is.* Cədvəl düzəldən, cədvəl tərtib edən idarə və ya müəssisə işçisi. [Hacıyeva] *elə gəldi ki, normaçılarınmı, cədvəlçilərinmi, mühəndislərinmi başsoyuqluğundan belə olmuşdur.* Mir Cəlal.

**CƏFA** *is.* [*ər.*] Əzab, əziyyət, üzüntü, incitmə. *Xəzanə meyl elədi, almadı vəfa nəzərə; Yetişdi bülbülə çox-çox qəmü cəfası gülün.* X.Natəvan. [Vaqif:] *Görmüşəm şahların vəfasını mən; Xanların zülmünü, cəfasını mən.* S.Vurğun. ◻ **Cəfa çəkmək** – iztirab çəkmək, əziyyət çəkmək. *Qıymazdı intiqamə məni zardən rəqib; Çəkmiş olaydı mən təki yarın cəfasını.* S.Ə.Şirvani. **Cəfa vermək** – mənəvi əzab vermək, əziyyət vermək, zülm etmək. **Cəfasını çəkmək** – əziyyətini çəkmək, möhnətini çəkmək, dərdbəlasını çəkmək. *Cəfasın çəkən səfasın görər.* (Ata. sözü). *Buna baxmayaraq, Mehriban ərinin hər cəfasını çəkən, onun rahat yaşaması üçün hər bir fədakarlığa hazır olan bir qadın idi.* S.Hüseyn.

**CƏFAÇI** b a x **cəfakeş**. *Min tən ilə bir cəfaçı səyyad; Ol zarə yetmişdi, qıldı fəryad.* Füzuli.

**CƏFAKAR** *sif.* və *is.* [*ər.* cəfa və *fars.* ...kar] Cəfaverən, əzabverən, incidən, zülmkar. *Ol cəfakar nəzərdən bizi atmış kimidir; Qeyr ilə həmdəm olub, ülfəti qatmış kimidir.* Q.Zakir. *Ələsgər eşqə düşüb; Sevdi cəfakarı genə.* Aşıq Ələsgər. *Nə rəhm bilər, şərm qanar, ağlamaq anlar; Böylə fələk olmaz! Yox böylə ikidilli, yamanüzlü cəfakar; Bir zərrə utanmaz!* M.Ə.Sabir.

**CƏFAKARLIQ** *is.* Cəfa vermə, əzab, əziyyət vermə; incitmə; zülmkarlıq. ◻ **Cəfakarlıq etmək** – əzab vermək, incitmək, zülm etmək. [Cavad bəy:] *Xan cənabınıza məlum olan ədavətə görə Səməd xanın oğlu Səfiqulu xan böyük cəfakarlıq edir.* N.Vəzirov.

**CƏFAKEŞ** *sif.* [*ər.* cəfa və *fars.* keş] Cəfa çəkən, hər cür dərdə, əzaba dözən, möhnətə qatlaşan. *Nə işdir, ey fələk, dildarı dildarından ayırmaq; Cəfakeş aşiqi yari-vəfadarından ayırmaq?* Füzuli. *Doğrudan.. ana qədər dözümlü cəfakeş məxluq yoxdur.* Ə.Vəliyev. *Beyrək və yoldaşları cəfakeş kürəkçilərlə həsrətli doğma qardaşlar kimi bir-birlərinə sarmaşdılar.* M.Rzaquluzadə.

**CƏFALANMA** "Cəfalanmaq"dan *f.is.*

**CƏFALANMAQ** *f.* Cəfa çəkmək, əzab çəkmək, zülm çəkmək, möhnət çəkmək, iztirab çəkmək. *Pərimi gördəndə edim ziyarət; Canım yar yolunda cəfalanıbdı.* Qurbani. *Bundan belə bizi sərəfraz elə; Canım çox yolunda cəfalanıbdır.* M.P.Vaqif.

**CƏFALI** *sif.* Cəfaverən, əziyyətə düçar edən, incidən.

**CƏFƏNG** *sif.* [*ər.*] Mənasız, boş, dəyərsiz. [Firəngiz Muxtara:] *Bunlar çeynənmiş cəfəng sözlərdir.* B.Bayramov. *Əsədüddövlə saxta təkəbbürlü, özünüçəkən, ağızdan cəfəng bir adam idi.* P.Makulu.

**CƏFƏNGİYAT** *is.* [*ər.*] Cəfəng, boş, mənasız, dəyərsiz sözlər, çərən-pərən. ..*Bağışla, molla əmi, deyəsən, çox cəfəngiyat söylədim.* C.Məmmədquluzadə.

**CƏFƏNGLƏMƏ** "Cəfəngləmək"dən *f.is.*

**CƏFƏNGLƏMƏK** *f.* Boş-boş danışmaq, mənasız sözlər danışmaq, çərən-pərən danışmaq, çərənləmək.

**CƏFƏNGLİK** *is.* Boşluq, mənasızlıq, dəyərsizlik. *Cəfənglik eləmək.* // Cəfəng sözlər, cəfəngiyat, çərən-pərən.

**CƏFƏRİ** *is.* [*ər.*] *bot.* Keşnişə oxşar yeyilən bostan bitkisi. *Cəfəri toxumunda efir yağı var.*

**CƏFƏROTU** *is. bot.* Vəzəriyə oxşar yeyilən bostan bitkisi.

**CƏFTƏ** *is.* [*ər.*] Möhkəm bağlanmaq üçün qapıya, pəncərəyə və s.-yə vurulan dəmir qarmaq. [Əbülhəsənbəy:] ..*Xidmətçi yatan qapının çöldən cəftəsini vurdum.* M.S.Ordubadi. *Rəzələri paslanmış bir qapı küləkdən açılıb örtülür, sallanan cəftəsi gah taxta qapıya, gah da dəmir halqaya toxunurdu.* M.Rzaquluzadə.

**CƏFTƏLƏMƏ** "Cəftələmək"dən *f.is.*

**CƏFTƏLƏMƏK** *f.* Cəftə ilə bağlamaq, cəftəsini vurmaq. [Qorodovoy] *qapının bir tayını cəftələyərək dedi: – Qurtardı.* Mir Cəlal. *Xəlil Mirzə yüyürüb özünü stansiya rəisinin yanına saldı və qapını tez içəri tərəfdən cəftələdi.* Q.İlkin.

**CƏFTƏLƏNMƏ** "Cəftələnmək"dən *f.is.*

**CƏFTƏLƏNMƏK** *mach.* Cəftə ilə bağlanmaq, cəftəsi vurulmaq. *Qapı içəridən cəftələnib.*

**CƏFTƏLİ** *sif.* Cəftəsi olan. *Cəftəli pəncərə. – Bir otaq qapısı qara cəftəli; Oturardıq, o dəli, mən dəli; Bəzən ta sübhə kimi şeir oxuyardıq; Məzəli-məzəli.* R.Rza. // Cəftə ilə bağlanmış, cəftəsi vurulmuş.

**CƏFTƏSİZ** *sif.* Cəftəsi olmayan. *Cəftəsiz qapı.*

**CƏFTƏŞƏKİLLİ** *sif.* Cəftəyəoxşar, cəftə kimi.

**CƏHALƏT** *is.* [*ər.*] Avamlıq, nadanlıq, cahillik, mədəni gerilik, mədəniyyətsizlik, elm və mərifətin olmadığı hal. *Cəhalətlə mübarizə ziyalılardan böyük iradə, cəsarət və mətanət tələb edirdi.* A.Şaiq. [Məhərrəm:] *Ah! Cəhalət! Cəhalət! Səndən daha nələr gözləmək olmaz!* C.Cabbarlı.

**CƏHALƏTPƏRƏST** *is.* [*ər.* cəhalət və *fars.* ...pərəst] Kütlələrin cəhalətdə qalmasını istəyən, yeniliyə, tərəqqiyə, maarifə düşmən olan adam; irticaçı, maarif düşməni.

**CƏHALƏTPƏRƏSTLİK** *is.* Cəhalət tərəfdarlığı, cəhalətpərəst adamın zehniyyəti və işi, elmə, mədəniyyətə və maarifə düşmən olma. *Cəhalətpərəstlik bütün mədəniyyət üçün böyük bir təhlükə yaradır.*

**CƏH-CƏH** *təql.* Quşların ötərkən çıxardıqları xoş səs. *Quşların cəh-cəhi havaya ucaldı.* S.S.Axundov. *Quşlar... cəh-cəh ilə min cürə nəğmələr oxuyub, meşəni sədaları ilə doldurmuşdular.* A.Divanbəyoğlu. *Qarışdı qaqqıltılar; Büllur səsli cəh-cəhə; Yüksəldi hər budaqdan; Bir nazənin qəhqəhə.* Ə.Cavad. ☐ **Cəh-cəh vurmaq** – etmək, oxumaq (quşlar haqqında). *Bu quş göy çəmənin içindən naqafil cəh-cəh vurub havaya tullanır.* E.Sultanov. *Quşlar, quşlar, a quşlar! Cəh-cəh vurun burada; Gah yerdə, gah yuvada.* A.Səhhət. *Bir də gördülər, birdən bülbül gəlib, mənim qarşımda bitmiş ağacın budağında əyləşib başladı cəh-cəh vurmağa.* Ə.Haqverdiyev. ◊ **Bülbül kimi cəh-cəh vurmaq (ötmək)** – xoş avazla, xoş səslə, şirin-şirin oxumaq. [Hacı:] *Şərab həmişə insanın mizacını açır, .. görürsən ki, şairin təbi gəlir, natiqin nitqi açılır, xanəndə bülbül kimi cəh-cəh edir.* B.Talıblı. *Bülbül cəh-cəh vurub oxumazdı; Ona bülbül adı qoyulmasaydı?* B.Vahabzadə.

**CƏHD** *is.* [*ər.*] Bir işi yerinə yetirmək və ya bir şeyi əldə etmək üçün ciddi çalışma, səy və qeyrət göstərmə. [Vaqif:] *Mirzə Əliməmməd, mənə elə gəlir ki, "cəhd çarıq yırtar!" doğru məsəldir.* Çəmənzəminli. *Sübhanverdizadənin bütün cəhdləri əbəs yerə qanad çalan kor yatalaq kimi uçub getdi.* S.Rəhimov. ☐ **Cəhd etmək** – çox çalışmaq, səy və qeyrət göstərmək, cidd-cəhd etmək, can yandırmaq. [Mehriban] *nə qədər cəhd edir, cəld işləməyə çalışırdısa da, olmurdu, tez-tez çaşırdı.* H.Seyidbəyli. *Hər dəfə udqunub nəfəs almağa cəhd etdikcə* [Əlləzoğlu] *qızarıb pörtür, nazik boğazının damarları şişib, barmaq yoğunluğunda olur.* İ.Hüseynov. // Məqsəd. *Cəhdin nədir?*

**CƏHDLƏ** *zərf* Böyük səylə, ciddi çalışmaqla, ciddi işləməklə. *Cəhdlə işləmək. – Cəhdlə siçan taxtanı dələr.* (Ata. sözü). *Yarışda basılmamaq üçün .. cəhdlə işə girişməliyik.* (Qəzetlərdən).

**CƏHDLİ** *sif.* Çalışqan, cəhd göstərən, canyandıran.

**CƏHƏNG** *is.* Ağızın küncü. [Musanın nəvəsi] *.. şalvar cibindən çıxartdığı ağappaq bir yaylıqla cəhənglərinə bulaşan qatığı təmizcə sildi.* Qantəmir. *Qəzəbindən* [Göyüşün] *cəhənglərində köpük göründü.* Ə.Abbasquliyev.

**CƏHƏNNƏM** *is.* [*ər.*] 1. Bu dünyada günah işlər görmüş adamların öldükdən sonra əbədi əzab çəkəcəkləri yer. [Xortdan:] *Nagah xəyalıma cəhənnəm düşdü.* Ə.Haqverdiyev. [Arvadı ustaya:] *A kişi, ağanın .. dalınca o qədər adam gedəcək ki, onda qıl körpüdən keçə bilmərik, .. cəhənnəmə töküllük.* Çəmənzəminli.

2. *məc.* Son dərəcə əzablı, əziyyətli, işgəncəli, dözülməz şərait, mühit haqqında. [Yaşlı kişi:] *O ili bağ mövsümü mənim üçün bir cəhənnəm kimi keçdi.* S.Hüseyn. [Ramazan:] *Əgər keçmişdə cəhənnəmi görmək istəsəydin, gərək Bakı mədənlərinə gələydin.* M.Hüseyn. // Dözülməz dərəcədə isti yer. *Səqfi, divarları, döşəməsi nəm; Qışda buzxanadır, yayda cəhənnəm.* H.K.Sanılı. *Yayı cəhənnəm qədər isti olan .. bu qəsəbədən milyonlarla adam keçmişdir.* Ə.Əbülhəsən.

◊ **Cəhənnəm ol!** – çıx get! Rədd ol! [Məşədi Zeynəb acıqlı və ucadan:] *Cəhənnəm olun buradan, yoxsa, vallah, bu daşnan vurub başınızı yararam.* C.Məmmədquluzadə. [Məşədi İbad Həsən bəyə:] *Cəhənnəm ol o yana, mürtəd! Mənə meymun deyib, sonra da əl verirsən?* Ü.Hacıbəyov. [Yusif:] *Qoy cəhənnəm olsun!* [Səməd:] *Qaradonlunu dindirən xeyir tapmaz.* İ.Hüseynov.

**Cəhənnəmdən biletsiz qaçan** – çox kifir, eybəcər adam haqqında. *Mümkün deyil ki, Bədircahana küpəgirən qarı, ya ki cəhənnəmdən biletsiz qaçan deməyəsən.* N.Vəzirov. **Cəhənnəmə ki…** – nə işimə, nə vecimə, nə olsun ki (laqeydlik bildirir).

**CƏHƏNNƏMLİK** 1. *sif.* Qarğış, söyüş məqamında işlənilir. [Oğlan:] *Bəli, cəhənnəmlik Nikolayın babası bizim babaları bu yerlərə sürgün etmişdi.* M.Rzaquluzadə.

2. Cəhənnəmi andıran, cəhənnəm kimi; dəhşətli. *Mənim bu gün cəhənnəmlik duman almış yollarımı; Bir əzrail pəncəsi ki, sarmış cansız qollarımı.* Ə.Cavad.

**CƏHƏT** *is.* [*ər.*] 1. Tərəf, yön, səmt. *Cəhətləri seçmək çətin idi. Nəriman dönüb dala baxanda gəldiyi yerin də izini itirmiş gördü.* Mir Cəlal.

2. Bir şeyin tərkib hissəsi, elementi. *Məfhumun iki cəhəti. – İndi məsələnin ikinci cəhəti qalırdı..* S.Hüseyn.

3. Bir şeyə aid olan, onu səciyyələndirən keyfiyyət, əlamət, xüsusiyyət. *Əsərin kompozisiya cəhəti. Filmin bədii cəhəti. Layihənin texniki cəhəti. – Bir xalqın ən gözəl cəhətlərini özündə təcəssüm etdirən adamlar olursa, onlardan biri də Həzi Aslanov idi.* M.İbrahimov. *Çayqırağının yaxşı bir cəhəti də bu idi ki, su və peyinlik yaxın olduğundan, burda .. lobya, soğan əkirdilər.* Ə.Əbülhəsən.

4. Səbəb bildirir – görə. *Çərx hər ay başına salmış qaşından bir xəyal; Bu cəhətdəndir hər ay başında olmaq bir hilal.* Füzuli. *..Xəstə olduğum cəhətə bu yay xırmanım hamıdan geriyə qalmışdı.* S.S.Axundov.

**CƏHƏTCƏ** *zərf* …baxımından, …görə, …etibarilə. *Bu qəsr Bağdad qəsrlərinin ən kiçiyi, lakin ziynət və zənginlik cəhətcə ən böyüyüdür.* M.S.Ordubadi.

**CƏHL** *is.* [*ər.*] 1. Nadanlıq, avamlıq, cahillik, cəhalət. *Elm bir nur, cəhl zülmətdir; Cəhl duzəxdir, elm cənnətdir.* S.Ə.Şirvani. *Cəhlin əllərində qılınc görürsən; Ağlın ayağında qara bir tikən.* M.Müşfiq.

2. *sif.* Çox kəc, çox tərs, inad. *Cəhl adam.* □ **Cəhl etmək (eləmək)** – tərslik eləmək, kəclik göstərmək, inad eləmək. *Fərəc bəyin naqis cəhətlərindən birisi də nahaq yerə xırda işdən ötrü cəhl eləməsi, öz dediyini sübuta çatdırmağa çalışması, haqqı batil eləməsi imiş.* Ə.Vəliyev. **Cəhlə salmaq** – düz şeyi dolaşığa, çətinə salmaq. [Şirzad Rüstəmə:] *Bəli, siz gərgin işləməkdən qorxursunuz! Belə olmasaydı, aydın mətləbi cəhlə salmazdınız.* M.İbrahimov.

**CƏHLKAR** *sif.* və *is.* [*ər.* cəhl və *fars.* kar] Tərs, inadcıl, höcət, inad, dediyindən əl çəkməyən, inadkar. *Çox cəhlkar adamdır.*

**CƏHRƏ** *is.* 1. Yun əyirmək üçün əl ilə işlədilən ən sadə alət. *İydə varsa, cəhrədə də var.* (Məsəl). *Mahmudun evinin qabağı. Sol tərəfdə evinin qapısı, qapının yanında bir cəhrə qoyulub.* Ə.Haqverdiyev. [Göyçək] *sonra da cəhrənin böyründə oturub yun əyirməyə başladı.* Ə.Vəliyev.

2. *məc.* Nasaz, primitiv şey haqqında.

**CƏHRƏÇİ** *is. köhn.* Başqaları üçün cəhrədə yun əyirən.

**CƏHRƏÇİLİK** *is. köhn.* Cəhrədə yun əyirmə işi, peşəsi. *Fatma cəhrəçilik edib bir növ gündəlik çörəyini qazanırdı.* S.S.Axundov. *Mən uşaqları cəhrəçiliklə böyütdüm.* S.Rəhimov.

**CƏLAYİ-VƏTƏN** [*ər.*] Vətənindən ayrı düşmüş, dərbədər düşmüş, həyatını qürbətdə keçirən. □ **Cəlayi-vətən olmaq** – vətənindən ayrı düşmək, yurdsuz-yuvasız olmaq, qürbətə düşmək, dərbədər düşmək. [Qurbani:] *Nə müddətdi cəlayi-vətən olmuşam; Baş götürüb Gəncə deyib gedirəm.* "Qurbani". [Oxumuş adamların] *heç biri şəhərimizdə baş çıxarda bilməyib, tamam cəlayi-vətən olmuşdular..* E.Sultanov.

**CƏLB** [*ər.*] Özünəçəkmə, cəzbetmə. □ **Cəlb etmək** – 1) çəkmək, cəzb etmək, özünə tərəf çəkmək. *Hamının hüsn-rəğbətini cəlb etmək.* – [Sabbah:] *İsfahan səmtini etdim məskən; Məni cəlb etdi Nişabur yenidən.* H.Cavid. [Hüseyn] *məharət işlədib kəsir yolunu; Yenidən cəlb edir döyüşə onu.* M.Rahim. *Sanki bu xaraba, Calalı bir maqnit kimi özünə cəlb edərək deyirdi..* S.Vəliyev; 2) bir işə qoşmaq, sövq etmək, bir işdə iştirak etdirmək. *İşə cəlb etmək. Söhbətə cəlb etmək.* – [Dəmir Ataşa:] *Ürək qızdırdığın adamlardan bir neçəsini cəlb elə!* Ə.Vəliyev; 3) *məc.* Maraq oyatmaq, diqqətini çəkmək. [Rüstəmbəy]

*..bığlarına və təzə qırxılmış üzünə elə məlahət verdi ki, Sofyanın fikrini özünə cəlb etdi.* Çəmənzəminli. *Münəvvər xanımın şəkli-şəmayıli Hacını lap əvvəl gündən cəlb eləmişdi.* Mir Cəlal.

**CƏLBEDİCİ** *sif.* Çox cəlb edən, çox maraqlı. *Cəlbedici kitab. Məclisdə, qonaqlıqda maraqlı və cəlbedici söhbət etmək bacarığı çox yüksək qiymətləndirilir.*

**CƏLD** *sif.* 1. *zərf* Tez, iti, yeyin, dərhal. *Cəld oxumaq. Cəld addımlamaq. Cəld çevrilmək. – Xanlar cəld geriyə döndü. Çuxur bir yer tapıb, daldalanmaq istədi.* M.Hüseyn. *Əlləzoğlu taxta kimi quru ovcunu qorun üstünə basıb, cəld yerə atıldı.* İ.Hüseynov. □ **Cəld tərpənmək** – cəld hərəkət etmək, qabaqlamaq. *Cəld tərpənsəydin, belə olmazdı.*

2. *sif.* Zirək, çevik, diribaş. *Cəld uşaq. – Hər ikisi qızların; Bir-birindən qəşəngdi; Biri sakit görkəmli; Biri cəlddi, ürkəkdi.* M.Dilbazi.

**CƏLDLƏŞDİRMƏ** "Cəldləşdirmək"dən *f.is.*

**CƏLDLƏŞDİRMƏK** *f.* Sürətini artırmaq, yeyinlətmək.

**CƏLDLƏŞMƏ** "Cəldləşmək"dən *f.is.*

**CƏLDLƏŞMƏK** *f.* İşində, hərəkətlərində daha cəld olmaq, zirəklik, çeviklik göstərmək.

**CƏLDLİK** *is.* Diribaşlıq, zirəklik, çeviklik; hərəkətdə, işdə itilik, sürət. *Məmmədvəli bir quş cəldliyi ilə ayağa qalxdı, o biri otağa keçdi.* S.Rəhman. *Lakin* [Əkbər] heç vaxt .. özündə belə cəldlik, *cəsarət və möhkəmlik hiss etməmişdi.* Mir Cəlal. □ **Cəldlik eləmək (etmək)** – zirəklik göstərmək, zirək (cəld) tərpənmək, çeviklik göstərmək. [Alacəhrə] *nə qədər cəldlik etsə də, axırda dadlı qoz ləpəsi onun əsir düşməsinə bais olardı.* S.Axundov.

**CƏLƏ** *is.* At quyruğu qılından ilmək şəklində düzəldilən tələ; duzaq. *Hər səhər malların altını təmizləyib, su və yemlərini verdikdən sonra mən həyatimizdəki peyinlikdə cələ qurardım.* M.İbrahimov. // Məc. mənada. [Ağa:] *Gözəl bir arvad da olsa, başı əziləsi bir ilandır. Az-az kişi onun cələsindən çıxa bilər.* S.Rəhimov.

◊ **Cələ qurmaq** *məc.* – birinə qarşı hiylə qurmaq, tor qurmaq, tələ qurmaq. **Cələyə salmaq** – tora salmaq. *Üç nəfər mərd, sahibi-iman; Üçü bir yerdə etdilər peyman; İstəyib salsın özgəsin cələyə; Düşdülər özləri haman tələyə.* Ə.Qəmküsar.

**CƏLƏSƏ** *is.* [*ər.*] *köhn.* İclas, məclis. *İndi.. cələsə olacaq, gəl otur, sənə bir stəkan çay verim, sonra gedərəm.* M.İbrahimov. [Hacı Əli:] *Cələsəmizi açmadan əvvəl sizə xoş bir xəbər vermək istəyirəm.* P.Makulu.

**CƏLLAD** *is.* [*ər.*] 1. Ölüm hökmünü icra edən adam. [Xan] *cəllad çağırıb əmr elədi ki, Alı kişinin boynunu vursun.* "Koroğlu". *..Başım cəllad əlində; Dilim səni haraylar.* (Bayatı).

2. *məc.* Qaniçən, qəddar, mərhəmətsiz adam. [Rəhim:] *Mahmud cəlladın biridir, arvadı ondan bədtər.* Ə.Haqverdiyev. [Dərviş:] *O baxış öylə bir baxış idi ki, cəllad görsə idi, xəncərini yerə atardı.* A.Divanbəyoğlu.

3. *məc. klas.* Gözəlin məftunedici qaşlarına, gözlərinə işarə. *Siz bilin, mail oldum; Bir qaşı cəllada bu gün.* Aşıq Ələsgər.

**CƏLLADLIQ** *is.* Zalımlıq, qəddarlıq, amansızlıq, mərhəmətsizlik, yırtıcılıq. [Elxan:] *Mən üzümə bir din qalxanı çəkib, cahangirlərin cəlladlığını qəbul edə bilmərəm.* C.Cabbarlı.

**CƏM** *is.* [*ər.*] 1. Bir şeyin ümumi sayı, miqdarı, toplusu. □ **Cəm etmək (eləmək)** – toplamaq, yığmaq. *Xülasə, yoldaşlarımı bir yerə cəm elədim və ağdamlılar kimi başladıq hesab görməyə.* C.Məmmədquluzadə. *Azacıq məvacibə qənaət edən muzdur öz boğazından qəpik-qəpik kəsib, on ilin ərzində altı yüz manat pul cəm etmişdi.* S.M.Qənizadə. **Cəm olmaq** – toplaşmaq, yığışmaq. *Meşənin tamam bülbülləri tarların səsinə cəm olmuşdular.* Ə.Haqverdiyev. *Sabah açıldı. Gün qalxdı. Böyük, kiçik hamı kluba cəm oldu.* Qantəmir.

2. *riyaz.* Bir və ya bir neçə ədədin üst-üstə gətirilməsindən hasil olan ədəd, toplama.

**CƏMADAT** *is.* [*ər.*] *klas.* Cansız təbiət. *Əkin yeri iki qisim şeydən əmələ gəlib: birisi cansız şeydən, yəni cəmadatdan və birisi canlı şeydən, yəni heyvanat və nəbatatdan məxluq olan şeylərdən.* (Qəzetlərdən).

**CƏMADİYƏLAXİR** *is.* [*ər.*] Ərəb qəməri təqvimində altıncı ayın adı.

**CƏMADİYƏLƏVVƏL** *is.* [*ər.*] Ərəb qəməri təqvimində beşinci ayın adı.

**CƏMADİYƏSSANİ** b a x **cəmadiyəlaxir**. [Hacı Əli:] *Dedim ki, yazır, cəmadiyəssani ayının 14-də şah məşrutənin hökmünü verib.* P.Makulu.

**CƏMDƏK** *is.* 1. Heyvan ölüsü, leş, cəsəd. *Kənddən bir dənə biyar araba gətirib, qabanın cəmdəyini içinə yıxıb, özüm də üstündə yola düşdüm.* Ə.Haqverdiyev. *Yolun üstündə qoxumuş bir köpək cəmdəyi düşmüşdü.* M.S.Ordubadi.

2. İnsan bədəni, bədən. *Neçə illər ondan sonra yolçular; Bir çuxurda iki cəmdək tapdılar.* A.Səhhət. [Məmmədəli:] *Bacıoğlu! Yatırdıb ağzı yerdə o qədər goparam cəmdəyinə, şişib dama dönərsən.* N.Vəzirov.

◊ **Cəmdəyinə döşəmək** – b a x **canına döşəmək** (**"can"**da). *Əminə.. Sonanın tutqunluğuna əhəmiyyət verməyib onun cəmdəyinə döşəyirdi.* Ə.Əbülhəsən. [Möhlətov:] *Yaxşı danışan uşaqlardan bir-ikisini də kənara çəkib öyrədərəm. İclasda o ki var Heydərovun cəmdəyinə döşəyərəm.* Mir Cəlal.

**CƏMDƏKYEYƏN** *is.* Cəmdək, leş yeməklə dolanan yırtıcı quş.

**CƏMƏN, CƏMİYYƏN** *zərf* [*ər.*] *köhn.* Bütünlüklə, hamılıqla, hamısı bir yerdə, tamamilə. *Mən girəndə cəmən durdular ayağa.* C.Məmmədquluzadə. *Karvan cəmiyyən, arvadlı-kişili məzarın ətrafına yığışıb tamaşa edirdilər.* E.Sultanov.

**CƏMİ** *is.* [*ər.*] Bütün, hamı. [Mirzə Heydər:] *Cəmi aləm* [atama] *rəhmət oxuyur.* Ə.Haqverdiyev. *Haşım.. az bir zamanda fəhləlikdən çıxıb Hacı Məhəmmədin cəmi işlərinə baxıcı oldu.* B.Talıblı. // Bütün, tamam. *Səs əvvəl* [Zeynalın] *qulaqlarında əcib bir halla cingildəyib, cəmi bədəninə sirayət etdi.* Çəmənzəminli.

2. Cəmi(si), üst-üstə, ancaq. *Onu cəmi bir neçə gündür tanıyıram. – Komandir Midhətin cəmi altı ay maşın sürdüyünü başa salır, düşmən "M-109"-ları ilə vuruşmağa ona icazə verə bilməyəcəyini təkrar edirdi.* Ə.Vəliyev. [Qız] *dünyada cəmi on səkkiz bahar görmüşdü.* İ.Əfəndiyev.

**CƏMİ-CÜMLƏTANI** *zərf* Cəmisi, ancaq. *O zaman bu kənddə cəmi-cümlətanı 15-20 tüstü var idi.* S.Rəhimov. *Ağsaqqallardan biri də cəmi-cümlətanı otuz yaşı olan Polad idi.* S.Rəhman. [Rəşid:] [Bəyim xala] *cəmi-cümlətanı iki kərə mənim suallarıma bir qədər təfərrüatla cavab vermişdi.* İ.Hüseynov.

**CƏMİSİ** *zərf* Ancaq, yalnız, vur-tut. [Tahir] *ikiotaqlı təzə mənzilində cəmisi bir həftə qalmışdı.* M.Hüseyn. *Hacı Səmsamın cəmisi üç kəndi vardı.* P.Makulu.

**CƏMİYYƏT** *is.* [*ər.*] 1. Konkret tarixi-maddi həyat şəraiti ümumiliyi əsasında birləşmiş insan toplusu. *İnsan cəmiyyəti. Cəmiyyətin inkişafı. Cəmiyyət tarixi. Cəmiyyət haqqında elm* (cəmiyyətşünaslıq). – [Aşıq:] *Sağ olun, əziz yoldaşlar, xalqa, cəmiyyətə xidmət eləmək bizim vətəndaşlıq borcumuzdur.* B.Bayramov. // Tarixən müəyyənləşmiş iqtisadi quruluş və ona uyğun üstqurum. *İbtidai cəmiyyət. Sosializm cəmiyyəti. Kapitalizm cəmiyyəti.* – [Almaz:] *Yoldaşlar, mədəni cəmiyyət bu gündə yaşaya bilməz.* C.Cabbarlı.

2. Hər hansı (mənşə, vəziyyət, mənafe və s.) ümumiliyi əsasında birləşən adamlar mühiti. *Zadəgan cəmiyyəti. Yüksək cəmiyyətdə dolaşmaq.* // İctimai mühit. *Cəmiyyətdə özünü apara bilmək. – Taleyini ev xidmətçiləri ilə birləşdirən bir qızın cəmiyyətə girə bilməsi və kütlə arasında müəyyən bir mövqe tutması mümkün deyildir.* M.S.Ordubadi.

3. Qarşılarına ümumi məqsəd qoymuş adamlar birliyi; təşkilat. *Tələbə elmi cəmiyyəti. İdman cəmiyyəti. Siyasi və elmi bilikləri yayan cəmiyyət. Səhmdarlar cəmiyyəti. – "Səadət" cəmiyyəti maarifi öz öhdəsinə almaq istəyirdi.* Mir Cəlal.

**CƏMİYYƏTÇİ** *is.* Cəmiyyət xadimi; cəmiyyəti, xalqı sevən, ona xidmət edən adam, ictimai xadim. *Mirzə Fətəli bir ədib və bir şair olmaqdan daha artıq bir cəmiyyətçi, bir əməlpərvərdi.* C.Cabbarlı.

**CƏMİYYƏTÇİLİK** *is.* Cəmiyyəti, xalqı sevmə, ona xidmət etmə.

**CƏMİYYƏTDƏNQAÇAN** *sif.* Adamlara isinişməyən, yaxınlaşa bilməyən, onlarla ünsiyyət bağlamayan, üns tutmayan. *Cəmiyyətdənqaçan adam.*

**CƏMİYYƏTƏZİDD** *sif.* Cəmiyyətə, cəmiyyətin mənafeyinə zidd olan, yabançı olan. *Cəmiyyətəzidd hərəkət.*

**CƏMİYYƏTİ-XEYRİYYƏ** bax **xeyriyyə cəmiyyəti** (**"xeyriyyə"**də).

**CƏMİYYƏTPƏRƏST** [*ər.* cəmiyyət və *fars.* pərəst] bax **cəmiyyətçi**.

**CƏMİYYƏTPƏRƏSTLİK** bax **cəmiyyətçilik**.

**CƏMİYYƏTŞÜNAS** *is.* [*ər.* cəmiyyət və *fars.* …şünas] Cəmiyyət elmləri mütəxəssisi. ..[Həyatı] *dərindən və hərtərəfli öyrənib ümumiləşdirməli olan cəmiyyətşünas alimlərin, ilk növbədə iqtisadçıların qarşısına böyük və təxirəsalınmaz vəzifələr qoyulur.*

**CƏMİYYƏTŞÜNASLIQ** *is.* Cəmiyyət haqqındakı elmlərin məcmusu.

**CƏMLƏMƏ** "Cəmləmək"dən *f.is.*

**CƏMLƏMƏK** *f.* Toplamaq, bir yerə toplamaq (yığmaq). // Bir-birinin üstünə gəlmək. *Ədədləri cəmləmək.* // Bax **cəmləşdirmək**. *Sənubər haqqında eşitdiklərini bir yerə cəmləmək .. Hidayət üçün həmişəkindən .. müşkül idi.* B.Bayramov.

**CƏMLƏNMƏ** "Cəmlənmək"dən *f.is.*

**CƏMLƏNMƏK** *f.* Bir yerə yığılmaq, bir yerə toplanmaq, bir yerdə mərkəzləşmək. [Ərəstunun] *fikirləri yenə öz dastanı üzərində cəmləndi.* S.Rəhimov. *Bütün duyğularım gözümə cəmlənmişdi.* Mir Cəlal.

**CƏMLƏNMİŞ** *f.sif.* Bir yerə toplanmış, bir yerə yığılmış, bir-birinin üstünə qoyulmuş. *Prokuror mizin üstündə cəmlənmiş yetmiş iki min manatı* [muzdura] *göstərib rus dili ilə bir-iki söz dedi.* S.M.Qənizadə.

**CƏMLƏŞDİRMƏ** "Cəmləşdirmək"dən *f.is.*

**CƏMLƏŞDİRMƏK** *f.* Cəmləmək, mərkəzləşdirmək. *Bütün diqqətini* [Xəlil] *bir nöqtədə cəmləşdirdi.* M.Hüseyn. *Qız dik Eyvazın gözlərinə baxır, sonra ani olaraq, ya kəndlərinə tamaşa edir, yaxud Qaratəpənin tapdaq yerlərinə nəzər salıb təkrar baxışını Eyvazın sifətində cəmləşdirirdi.* Ə.Vəliyev.

◊ **Özünü cəmləşdirmək** – 1) fikrini, diqqətini, iradəsini bir şey üzərində mərkəzləşdirmək; 2) özünü toplamaq, özünü ələ almaq. *Qoca xan özünü cəmləşdirdi.* S.Rəhimov. *Nərgiz dodağını gəmirib özünü cəmləşdirdi.* B.Bayramov.

**CƏMLƏŞMƏ** "Cəmləşmək"dən *f.is.*

**CƏMLƏŞMƏK** *f.* Bir yerə toplanmaq, bir yerə yığılmaq, cəm olmaq. [Salman bəy:] *Balam, sən də mən günlü, mən də sən günlü, sabah ertə dərdlilər cəmləşib.* N.Vəzirov. *Dəstə bir yerə cəmləşər, bir "ana" seçərdi.* H.Sarabski.

**CƏNAB** *is.* [*ər.*] 1. *köhn.* Görünüşündən cəmiyyətin imtiyazlı təbəqəsinə mənsub şəxsə oxşayan adam. *Bir cənab içəri daxil oldu. Bu cənab kimdir?* // Ümumiyyətlə hörmət, sayğı məqamında işlədilir. *Biz axund cənablarının fərmayişini axıradək təsdiq edirik.* C.Məmmədquluzadə. [Sərnişin:] *..Görünür, sən həmişə faytonda gəzmiş cənablardansan..* Qantəmir.

2. İmtiyazlı cəmiyyətə mənsub şəxslərə, eləcə də başqa dövlətlərin nümayəndələrinə və ya vətəndaşlarına nəzakətlə müraciət forması. *Cənab səfir. Cənab general.* // Bəzən istehza, kinayə ilə deyilir. *Bu cənablardan hər şey gözləmək olar.* – [Mirzə Abbas:] *Cənab naçalnik, bizim şəriətimizdə keflənmək məndir və siz cənabın hüzurunda mən o qələti eləmərəm və edə bilmərəm.* C.Məmmədquluzadə.

3. Müsəlmanlarda: təzim ifadəsi olaraq Allahın, peyğəmbərlərin və ya müqəddəs sayılan şəxslərin adlarının əvvəlinə gətirilir; həzrət.

**CƏNAZƏ** *is.* [*ər.*] Kəfənə tutulmuş ölü; meyit. *Həcər Mehdinin cənazəsi üstünə düşüb, göz yaşlarını bahar buludu kimi axıdır.* "Qaçaq Nəbi". // Tabut. *Müəllimənin cənazəsini qoymaq üçün Tərlan dərs otaqlarından birini boşaltdırdı.* M.Hüseyn. *Birdən* [Adilə] *sanki müvazinətini itirib, cənazənin üstünə sərildi.* Ə.Məmmədxanlı.

**CƏNCƏL** 1. *sif.* Qarışıq, dolaşıq, davalı, qalmaqallı, şər. [Dilara Ağagülə:] *Nə üçün bütün bu cəncəl işlərdə gərək həmişə sən iştirak eləyəsən?* Ə.Məmmədxanlı. *Fotoqraf.. özünü cəncəl işlərdən uzaq tuturdu..* S.Vəliyev.

2. Davakar, qalmaqalçı, öcəşkən, böhtançı, şər. *Cəncəl adam.* – [Mürşüd:] *Sadığı gözləyirəm, bəs necə? O yazıq da mənim kimi düşmüşdü bir cəncəl arvadın əlinə, güclə yaxasını qurtardı.* S.Rəhman. [Çiyələk Hidayətə:] *Cəncəl müştəri görməmisən..* B.Bayramov. // *is.* Dava, qalmaqal, qovğa,

mübahisə. [Pəri Bəhrama:] *Yenə nə olub, Saranın əhvalındanmı əhvalın qarışıb?* C.Cabbarlı. *Bunun nigahında da cəncəldən başqa bir şey görmədim.* S.Rəhimov. [Zülfüqar:] *Rayona təzə gəlmişəm, aqronomam. Sizin camaatın cəncəlini kəsməyə gəlmişəm.* B.Bayramov. ☐ **Cəncəl çıxartmaq** – səbəbsiz yerə dava salmaq, qalmaqal salmaq, qovğa salmaq. [Baxşı:] *Canım, bir şey yoxdur, biz hələ burada çalıb oynayırdıq, bu oğlan gəldi, cəncəl çıxartdı.* C.Cabbarlı. [Cəmilə] *özilə həyat yoldaşı olacaq bir adamın .. ictimai bir yerdə cəncəl çıxarıb xuliqanlıq etməsinə bir məna verə bilməyirdi.* S.Hüseyn. **Cəncəl eləmək (salmaq)** – dava eləmək (salmaq), qalmaqal salmaq. [Məşədi İbad Həsənqulu bəy və Həsən bəyə:] *Cəncəl eləmək neyçün? Kişinin hamamında iki saatdır ki, çimibsiniz..* Ü.Hacıbəyov. **Cəncələ salmaq** – davaya salmaq, qalmaqala salmaq, pis, xoşagəlməz bir işə salmaq. [İmamyar Türbətə:] *Axır bilirəm, siz məni bir cəncələ salacaqsınız.* C.Cabbarlı.

**CƏNCƏLÇİ** *sif.* Cəncəl salan, qalmaqal salan, cəncəl, böhtançı, fitnəkar, cəncəl salmağı sevən, davakar. *Çox cəncəlçi adamdır.*

**CƏNCƏLLİ** *sif.* Davalı, dava-dalaşlı, qalmaqallı; çox qarışıq, çox dolaşıq, çox mübahisəli, başağrısına səbəb olan. *Müqim bəy Cavanşir rütbəyə nə qədər susasa da, indiki zamanda bu rütbə ona daha çox cəncəlli görünürdü.* S.Rəhimov. // *məc.* Çox mürəkkəb, narahatlıq doğuran.

**CƏNG¹** *is.* [*ər.*] *köhn.* Dava, müharibə, vuruş, döyüş. *Ağız açıb göylər belə heyran qaldı bu cəngə!* S.Rüstəm. ☐ **Cəng etmək** – müharibə etmək, vuruşmaq, döyüşmək. *Dördüncü otağın divarlarında Şahnamədə yazılan İranın qədim pəhləvanlarının və Mazandaran divlərinin surəti yazılmışdı ki, bir-birilə cəng edirdilər.* M.F.Axundzadə. *Od, tüstü içində etmişəm cəng; Heç olmamışam bu növ diltəng.* A.Səhhət.

**CƏNG²** *is.* [*fars.*] Paxır, pas. *Mis qazan cəng atıb.*

**CƏNGAVƏR** *sif.* [*fars.*] Cəsarətli, məharətli döyüşçü, yaxşı vuruşan, döyüşlərdə bişmiş döyüşçü; döyüşkən. *Cəngavər tayfalar.* – [Çopo:] *Cənubda cəngavər xalqlar var, məni göndər də ordu toplayım.* Çəmənzəminli. [Südabə:] *Səyavuşun sağlığına içdilər; O həm gənc və gözəl, həm də cəngavər.* H.Cavid. // İs. mənasında. *Çox keçməmiş Girdman cəngavərləri böyük meydanda dəniz kimi dalğalanıb təlatümə gəldilər.* M.Hüseyn. // B a x **rıtsar**.

**CƏNGAVƏRCƏSİNƏ** *zərf* Cəngavərə, cəsur döyüşçüyə yaraşan tərzdə, cəngavər kimi. *Cəngavərcəsinə vuruşmaq.*

**CƏNGAVƏRLİK** *is.* Vuruşlarda, döyüşlərdə fövqəladə məharət, rəşadət; döyüşlərdə, vuruşlarda bişmiş adamın halı. *Rüstəmbəy Qafqaz barəsində xanıma bir çox şeylər nağıl elədi, şücaət və cəngavərliyindən danışdı.* Çəmənzəminli.

**CƏNG-CİDAL** *is.* [*fars.*] *köhn.* Dava-dalaş, dava-mərəkə, qalmaqal. [Səkinə Rüstəmə:] *A kişi, – dedi, – eşitmişəm orada da cəng-cidal açmısınız.* M.İbrahimov. // Müharibə, vuruş, dava. *Başının üstündən əsrlərin cəng-cidalı ötüb keçən bu abidə öz vüqarını .. saxlamışdı.* B.Bayramov.

**CƏNGƏL** *is.* [*fars.*] Sıx, qalın ağac, kolkos, ot basmış yer. *Cəngəl də özünü bağ sanar.* (Ata. sözü). [Ağa Kərim xan:] *Görürsünüz, Züleyxa xanım, mənim qızım nə tez qalxıb, ..məlum işdir, cəngəldə ot tez bitər.* N.Vəzirov. *Allahverən dayı cəngəl bürümüş dam-daşını göstərdi.* S.Rəhimov.

**CƏNGƏLLİK** *is.* Sıx ağaclıq, kolluq, kolkosluq; keçilməz qalın meşə, ya kolluq. *Cəngəllikdə itmək.* – *Həmişə* [Hidayətə] *arıq, cansız-gücsüz görünən Həmişəyev .. cəngəllik içərisindən atılmağa hazır olan erkək şir kimi görünürdü.* B.Bayramov.

**CƏNGİ** *is.* [*fars.*] *mus.* Qəhrəmanlıq və cəngavərlik ruhunda hava. [Eldar:] *Zalıma gözdağı, bizə şan qılınc; Azadlıq uğrunda vuruşan qılınc. İndi dayansın Qacar! Cəngi çalın, hücum var!* S.Vurğun. *Koroğlunun cəngi havası dağlara, dərələrə səs saldı.* M.Hüseyn.

**CƏNGİMƏ** "Cəngimək"dən *f.is.*

**CƏNGİMƏK** *f.* Paxır basmaq, pas atmaq, paslanmaq.

**CƏNNƏT** [*ər.*] b a x **behişt**. *Bizim babamız Adəmə və anamız Həvvaya cənnətdə nə əskik idi, genə Allahın əmrini sındırdılar və*

*cənnətdən qovuldular? İnsan belədir!* M.F.Axundzadə. *Deyirlər ki, qış fəslində cənnətin qapıları Muğana tərəf açılır..* M.İbrahimov.

**CƏNNƏTLİK** b a x **behiştlik**.

◊ **Cənnətlik olsun!** – yeri cənnət olsun! (ölmüş adam haqqında). [Qadın:] *Kişi çox başlı adam imiş, cənnətlik olsun!* Mir Cəlal.

**CƏNUB** *is.* [*ər.*] 1. Dörd cəhətdən biri, *şimal* əksi. *Kompas cənubu göstərir.* // Şimala müqabil olan səmt, tərəf. *Calus Xəzərin cənub sahilində yaşıl bir şəhərdir.* M.İbrahimov. // Bir ölkənin, dövlətin, qitənin həmin istiqamətdə yerləşən ərazisi, hissəsi. *..Buludlar parçalanıb cənuba doğru axışmağa başladı.* Ə.Məmmədxanlı.

2. İsti iqlim qurşağında yerləşən ölkə, ərazi. *İstirahəti cənubda keçirmək. Cənub bitkiləri. – Durnalar dəstə-dəstə göydə uçar; Oxuyar nəğmələr, cənuba qaçar.* A.Səhhət. *Cənubda iki ölkəyə sərhəd olan səngərlər bir palaz kimi sərilmişdi.* M.Hüseyn. *Cənubda mart girən zaman; Əsil gözəl bahar olur.* M.Dilbazi.

**CƏNUBİ** *sif.* [*ər.*] Cənuba mənsub, isti iqlim qurşağına aid; cənubda olan. *Cənubi Amerika ölkələri.*

**CƏNUB-QƏRB** *is.* Üfüqün cənubla qərb arasındakı hissəsi, səmti. *Cənub-qərbə gedən yol.* // Ölkənin, dövlətin, qitənin həmin istiqamətdə yerləşən hissəsi. *Avropanın cənub-qərbi.*

**CƏNUBLU** *sif.* Cənub ölkələrinin birində doğulub yaşayan adam. *..Leninqradın havası rütubətli olduğundan, bir çox cənublular kimi..* [Nuriyyəyə] *də düşmür.* İ.Əfəndiyev.

**CƏNUB-ŞƏRQ** *is.* Üfüqün cənubla şərq arasındakı hissəsi, səmti. *Cənub-şərqə tərəf istiqamət almaq.* // Ölkənin, dövlətin, qitənin bu istiqamətdə yerləşən hissəsi. *Afrikanın cənub-şərqi.*

**CƏRCƏNƏK** *is.* Omba sümüklərini birləşdirən buğum. □ **Cərcənək olmaq** – omba ağrısı tutmaq. [Rüstəm kişi:] *Çünki tələsərsən, cərcənək olarsan.* M.İbrahimov.

◊ **Cərcənəyini ayırmaq** – əzişdirmək, kötəkləmək, cəzalandırmaq. [Kərim:] *Hanı o arvad kimi qaçıb gizlənən tülkü, bircə onu mənə verin, cərcənəyini ayırım.* Ə.Haqverdiyev.

**CƏRƏYAN** *is.* 1. Suyun öz məcrası ilə axması; axın. *İti cərəyan.* // Dənizlərdə, okeanlarda suyun hər hansı bir istiqamətdə hərəkəti, habelə müəyyən istiqamətdə hərəkət edən su axınının özü. *Dəniz cərəyanları. İsti cərəyan. Soyuq cərəyan.*

2. *fiz.* Elektrik yükünün hərəkəti; elektrik enerjisi. *Yüksəktezlikli cərəyan. Cərəyanın gücü. – Keçirici mühitdə əmələ gətirilən elektrik sahəsi elektrik cərəyanı əmələ gətirir.* Z.Kazımzadə.

3. *məc.* Ədəbi-bədii və ya ictimai, siyasi hadisə. *Satirik cərəyan. Mürtəce cərəyan. İncəsənətdə cərəyanlar. – "Kəşkül" səhifələrində köhnə sxolastik ədəbiyyat üslubu ilə hakim ədəbi cərəyan olmağa başlayan realizm ədəbi üslubu mübarizə edir.* M.İbrahimov.

◊ **Cərəyan etmək** – 1) keçmək, axmaq, hərəkət etmək. *Quru səhralar ancaq isti küləklər cərəyan edən zaman səslənir, həm də çox darıxdırıcı, yorucu olurlar.* S.Rəhimov; 2) baş vermək, olmaq. *Hadisə də o vaxt olduğu kimi, Qafqazın kim bilir harasında.. cərəyan edirdi.* Ə.Əbülhəsən. *Hadisələr sürətlə cərəyan edirdi.* Mir Cəlal; 3) keçmək. *Həyatın necə cərəyan edir?*

**CƏRƏYANÖLÇƏN** *is. xüs.* Elektrik və ya su cərəyanının gücünü ölçmək üçün cihaz.

**CƏRGƏ** b a x **sıra**. *Qadın üzünü çevirərək: – Geridə qalma, nizamı pozma, cərgəni düzəlt, – deyə, uca səslə komanda etdi.* S.S.Axundov. *Yolun hər iki tərəfi bir neçə cərgə ağaclıq idi.* M.Rzaquluzadə.

**CƏRGƏARASI** b a x **cərgələrarası**.

**CƏRGƏBƏCƏRGƏ** *zərf* Cərgə-cərgə, sıra-sıra, səfbəsəf. *Cərgəbəcərgə düzülmək.* – [Şair:] *Özünü kişidən əskikmi saydın; Dəlilər duranda cərgəbəcərgə? Sən, ey gözəl Nigar, sən olmasaydın; Koroğlu Koroğlu olmazdı bəlkə.* N.Xəzri.

**CƏRGƏ-CƏRGƏ** *zərf* Cərgələrlə, sıra-sıra, səf-səf, cərgələr halında. *Cərgə-cərgə durmaq. – Əllərdə yellənən qızıl bayraqlar; Gəlir cərgə-cərgə dalğalar kimi.* S.Vurğun. *Güclü biləyimizdə zamanın nəbzi vursun; Önümüzdə balalar düzülsün cərgə-cərgə.* S.Rüstəm.

**CƏRGƏLƏMƏ** 1. "Cərgələmək"dən *f.is.*

2. *zərf mənasında.* Cərgə ilə, cərgə-cərgə, sıra-sıra. *Evlər cərgələmə tikilib.*

**CƏRGƏLƏNMƏ** *f.* "Cərgələnmək"dən *f.is.*

**CƏRGƏLƏNMƏK** *f.* Cərgə-cərgə, sıra-sıra düzülmək, durmaq, sıralanmaq. *Baxın cərgələnib keçən əsgərə; Səsinə səs verir hər dağ, hər dərə.* S.Vurğun.

**CƏRGƏLƏRARASI** *sif. k.t.* Əkilmiş bitki cərgələri arasında olan. *Cərgələrarası sahə. Əkinlərin cərgələrarası becərilməsi.* – [Bilal:] *..Cərgələrarası suvarma cızlarını çəkmək böyük ustalıq istəyir.* B.Bayramov. // *is.* Əkilmiş bitki cərgələri arasında olan sahə. *Cərgələrarasının şumlanması. Bağ sahələrində cərgələrarasını becərmək üçün ayrıca "PV-1,7" markalı kotan tətbiq edildi.*

**CƏRGƏLƏŞMƏ** "Cərgələşmək"dən *f.is.*

**CƏRGƏLƏŞMƏK** bax **cərgələnmək**. *Bir qədər də oturub.. Quzu dağına və günbatandan gündoğana cərgələşən xırdaca dağlara tamaşa etməyi qəsd etdimsə, bacarmadım…* A.Divanbəyoğlu.

**CƏRGƏLİ** *sif. k.t.* Düzgün cərgə, sıra ilə əkilən. *Cərgəli əkin üsulu.*

**CƏRGƏVİ** 1. Bax **sıravi**. *Cərgəvi döyüşçü.*

2. Cərgə-cərgə, sıralarla, sıra ilə. *Gübrənin torpağa cərgəvi üsulla verilməsi. – Yeni çay tarlasında bitkilər cərgəvi üsulla əkilmişsə, 2-ci il payızın əvvəllərində cərgələrdə seyrəltmə keçirilməlidir.* F.Fətəlizadə.

**CƏRİDƏ** *is.* [*ər.*] *köhn.* Qəzet. [Qəzetçi:] *Mən cəridəm dolmaq üçün mətləbi uzatmışam.* M.Ə.Sabir. *Hərənin bir etiqadı var, hər cəridənin bir məsləki var, hər yazıçının bir mətləbi var..* C.Məmmədquluzadə.

**CƏRİMƏ** *is.* [*ər.*] Pulla ödənilən cəza növü. [Fəxrəddin:] *Məlumunuz olmalıdır ki, bunların əksəriyyəti cərimə, vergi və hərb təminatı müqabilində alınan qızlardır.* M.S.Ordubadi. // Öhdəliyi yerinə yetirmədiyinə, qaydanı pozduğuna görə verilən cəza, yaxud alınan nəğd pul. *Həcərin atası Mahmud bəyin yanına gəlir. Bu qədər cərimə verdikdən sonra Nəbini buraxdırır.* "Qaçaq Nəbi". [Hacı Fərəc:] *..İstəyirsənmi, müqaviləni pozub, səndən iki yüz manat cərimə alım, ha?* N.Vəzirov. [Tahir:] *Neçə həftədir bir yol da cərimə verməmişəm.* M.Hüseyn. ◻ **Cəriməsini vermək** – zərəri pulla ödəmək, pulla əvəzini vermək. [Ata:] *Oğul, Rövşən, get buzov yiyəsini tap, buzovun cəriməsini ver, razı sal.* "Koroğlu".

**CƏRİMƏLƏMƏ** "Cəriməvləmək"dən *f.is.*

**CƏRİMƏLƏMƏK** *f.* Birinə pul cəzası kəsmək: cərimə etmək. *Muzdur iltica ilə ondan soruşdu: ağruvi alım, bəy, axır bilmədim, pirğuror ağa məni Sibirə göndərir, yoxsa cərimələyir?* S.M.Qənizadə. [Mahmud:] *Heç bilirsən, ərbab nə eyləyib? Dədəmgili həm döydürüb, həm də cəriməleyib.* P.Makulu.

**CƏRİMƏLƏNMƏ** "Cərimələnmək"dən *f.is.*

**CƏRİMƏLƏNMƏK** *məch.* Cərimə edilmək, cərimə alınmaq.

**CƏRRAH** *is.* [*ər.*] Xəstələri yarmaq üsulu ilə müalicə edən həkim. *Evə çatan kimi Rəhim şəhərin məşhur cərrahını çağırtdı.* S.S.Axundov. *Cərrahlar yorulmayıb bıçaqlarını işlədirdi.* S.Rəhimov. *Bəhramı cərrah stoluna qoyanda həkim məni arxayın saldı.* Mir Cəlal.

**CƏRRAHİ** *sif.* [*ər.*] Cərrahlığa aid olan, cərrahlıqla bağlı olan. *Cərrahi əməliyyat. Cərrahi anatomiya. Cərrahi xəstə* (*cərrahlıq üsulu ilə müalicə olunmalı xəstə*).

**CƏRRAHİYYƏ** *is.* [*ər.*] Cərrahlıq. *Cərrahiyyə kafedrası. Cərrahiyyə şöbəsi. Cərrahiyyə əməliyyatı.* ◻ **Cərrahiyyə otağı** – xəstəxanada, xəstələrin operasiya olunduğu otaq. *Ağxalatlı həkim cərrahiyyə otağından çıxdı.* (Qəzetlərdən).

**CƏRRAHLIQ** *is.* 1. Xəstəliklərin operasiya üsulları ilə müalicəsi, habelə tibb elminin, xəstəlikləri operasiya yolu ilə müalicə üsullarından bəhs edən şöbəsi. *Tibb institutunun cərrahlıq fakültəsi. Göz cərrahlığı* (göz xəstəliklərinin operasiya üsulu ilə müalicəsi). // Cərrahlığa aid olan, cərrahlıqla bağlı olan. *Cərrahlıq təcrübəsi. Cərrahlıq klinikası. – Son dərəcə müxtəlif olan zədələnmələrin öyrənilməsi cərrahlıq sahəsinə aid olduğu üçün bu amillərin orqanizmə ancaq ümumi təsirini nəzərdən keçirək.* "İnsan nədən xəstələnir". // Operasiya əməliyyatlarında istifadə edilən. *Cərrahlıq alətləri. Cərrahlıq qayçısı.* // Operasiya ilə həyata keçirilməli olan; operasiyalıq. *On beş gün keçməmiş xəbər gəldi ki, Zahidin xəstəliyi bərkdir, cərrahlıq işi var.* Mir Cəlal.

2. Cərrahın işi, peşəsi, sənəti, ixtisası. *Cərrahlıqla məşğul olmaq. Cərrahlıq çətin sənətdir.*

**CƏSAMƏT** *is.* [*ər.*] Böyüklük, irilik, yekəlik. *Qafqaz dağlarının cəsaməti. – Qarabağ atlarının cəsamətini və yüngül-qoşqu qabiliyyətini yaxşılaşdırmaq üçün iri və elit Terek cins ayğırlardan da istifadə edilməlidir.* R.Səttarzadə.

**CƏSAMƏTLİ** *sif.* Böyük, iri, yekə, cüssəli. *Cəsamətli at.*

**CƏSARƏT** *is.* Qorxmazlıq, hünər, cürət. *Cəhalətlə mübarizə ziyalılardan böyük iradə, cəsarət və mətanət tələb edirdi.* A.Şaiq. // Cürət. [Bəypolad:] *Cəsarətimin əfv ediləcəyinə əminəm, çünki səmimiyyətdən irəli gələn qüsurlar daima əfv edilir.* H.Cavid. [Nuriyyə:] *Bütün gücümü, cəsarətimi toplayıb gedirdim.* İ.Əfəndiyev. ☐ **Cəsarət etmək** – ürəklənmək, ürək eləmək, cürət etmək, qorxmamaq. [Mürsəl:] *Hərdən cəsarət edib atmaq istəyəndə anam acıqlanır*(*dı*). Mir Cəlal. **Cəsarət etməmək** – qorxmaq, çəkinmək, ürək eləməmək. *Zeynal yavaşca addımlar ilə Mehribana yaxınlaşdı. Bir söz deyəcəkdi. Bir dürlü cəsarət etməyir, üzü gəlməyirdi.* **Cəsarət vermək** – cəsarətləndirmək, ürəkləndirmək, ürək vermək, cürətləndirmək. *Bu fikir* [Kazımı] *qorxutmadı, əksinə, qəribə bir cəsarət verdi..* M.İbrahimov. *Fərmanın sözləri Baxış bəyin ürəyincə oldu, Növrəstəni ələ keçirmək üçün ona cəsarət verdi.* Ə.Abasov. S.Hüseyn. *Rza duruxurdu, nə cavab verəcəyinə cəsarət etməyib yasalamağa üz qoydu.* Ə.Vəliyev. **Cəsarəti çatmamaq** – özündə cəsarət hiss etməmək, ürək eləməmək, cürət etməmək, qorxmaq. *Cərrahiyyə əməliyyatı aparmaq mümkün idi. Ancaq Leylanın cəsarəti çatmırdı.* B.Bayramov.

2. **Cəsarətlə** şəklində – ürəklənərək, qorxmadan, çəkinmədən. *İltifat eyləsəz, ey alicənab; Verərəm mən də cəsarətlə cavab.* A.Səhhət. *Qamçılayır cəsarətlə əyər-əskik nə vardırsa; Sözlər aydın, fikir dərin, məna böyük, məktub qısa.* R.Rza.

**CƏSARƏTLƏNDİRMƏ** "Cəsarətləndirmək"dən *f.is.*

**CƏSARƏTLƏNDİRMƏK** *f.* Cəsarət vermək, ürək vermək, ürəkləndirmək, ruhlandırmaq. *Səadət xanımın sualları məni cəsarətləndirirdi.* Mir Cəlal.

**CƏSARƏTLƏNMƏ** "Cəsarətlənmək"dən *f.is.*

**CƏSARƏTLƏNMƏK** *f.* Cəsarət etmək, qorxusu gedib cürətlənmək, ürəklənmək; özündə cəsarət hiss etmək; ruhlanmaq; daha heç şeydən qorxmamaq. [Qaçaqlar] *elə şiddətli cəsarətlənmişdilər ki, nəinki kəndlərə, hətta balaca şəhərlərə də hücum edirdilər..* E.Sultanov. [Qadın mərsiyəxana:] *Nəhayət, cəsarətləndim; mənə xudbin hisslər gəldi, o səs mənim olacaq – dedim.* Çəmənzəminli.

**CƏSARƏTLİ** *sif.* Cürətli, igid, ürəkli, qoçaq. *Taqət kəsən qarlı külək gərçi davam edirdi; Cəsarətli Əhməd lakin qeyrət ilə gedirdi.* A.Səhhət. *Yaşar cəsarətli olmağa çalışdı.* M.Rzaquluzadə.

**CƏSARƏTLİLİK** *is.* Cəsarətli adamın hal və keyfiyyəti; qoçaqlıq, hünərlilik, igidlik, zirəklik. *Futbol adamlarda kollektivçilik, iradəlilik, çeviklik, dözümlülük, cəsarətlilik, vəziyyəti düzgün qiymətləndirmək və bir çox başqa xüsusiyyətləri tərbiyələndirir.* Ə.Babayev.

**CƏSARƏTSİZ** *sif.* Qorxaq; cəsarəti, cürəti olmayan, ürəksiz, ağciyər. *Cəsarətsiz adam. Cəsarətsiz hərəkət.* // *zərf* Qətiyyətsiz, çəkinərək; qorxa-qorxa, çəkinə-çəkinə, cəsarət etmədən. [Xanım:] *Bilməyirəm, necə kitab verim ki, xoşlarına gəlsin: – dedi. Qulluqçu döyükdü. Xanım da cəsarətsiz bir halda duruxdu.* Çəmənzəminli. *Şiraslan cəsarətsiz bir səslə söhbəti dəyişirdi.* M.Süleymanov.

**CƏSARƏTSİZLİK** *is.* Cəsarətsiz adama xas olan hal; qorxaqlıq, ürəksizlik, ağciyərlik. *Cəsarətsizlik göstərmək.*

**CƏSƏD** *is.* [*ər.*] 1. Meyit, ölü bədəni. *..Dar ağaclarından asılmış yırğalanan qara cəsədlər görür, ürəkparçalayan ana fəryadı eşidirdim.* M.Rzaquluzadə. *Vuruşmada tələbələrdən biri öldü. Camaat və tələbələr onun qanını üzünə sürtüb fəryad qopara-qopara cəsədi mədrəsəyə apardılar.* P.Makulu.

2. Bədən. *Ta cəsədin cida olmayıb candan; Bil özünü artıq sultandan, xandan.* M.P.Vaqif. *Oğrun-oğrun daldalardan baxırsan; Alırsan cəsəddən canı, sevdiyim!* Aşıq Ələsgər.

**CƏSƏDLİ** *sif.* Bədəncə, boyca iri, gövdəli, vücudlu, cüssəli. *Sona xala yalan, yaltaqlıq, alçaqlıq sevməz, sağlam, erkəktəbiətli, ucaqamətli, cəsədli bir qadın idi.* S.S.Axundov.

**CƏSİM** *sif.* [*ər.*] Böyük, iri, yekə, gövdəli, cəsamətli, əzəmətli. *Tolstoyun, güllələrlə deşilmiş Hacı Muradı ayaq üstə qalxaraq, sonra ölü bir halda yerə yıxılarkən, adama elə gəlir ki, qoca, cəsim bir dağ uçub tökülür.* C.Cabbarlı. *Gəlin qayası cəsim heykəl kimi şahanə bir vüqarla dayanmışdı.* B.Bayramov.

**CƏSUR** *sif.* Cəsarətli, igid, qoçaq, qorxmaz, ürəkli. *Mərdan sağlam, cəsur bir uşaq idi.* S.S.Axundov. [Ceyran] *cəsur, mətin, qəhrəman bir qadın idi.* S.Hüseyn.

**CƏSURANƏ** *zərf* [*ər.* cəsur və *fars.* …anə] Qorxmadan, çəkinmədən; cəsur, qoçaq adama yaraşan bir tərzdə; igid kimi, igidcəsinə, qoçaqlıqla, cəsarətlə. *Cəsuranə meydana atılmaq.*

**CƏSURLUQ** *is.* Cəsarət, igidlik, qoçaqlıq, ürəklilik, qorxmazlıq.

**CƏVANƏ** *sif.* [*fars.*] *köhn.* Cavan qadın (qız). *Haşım ev sahibinin qocalığını və onun zövcəsinin cavanə olduğunu görüb, Hacı Məhəmmədin məsləhətini yadına saldı.* B.Talıblı.

**CƏVƏRƏN** *is.* Balaca səbət, qovsara. *Bir cəvərən tut. – Piri kişi özü bir səbət götürdü və Qaraca qıza da bir cəvərən verdi.* S.S.Axundov.

**CƏZA** *is.* [*ər.*] Hər hansı təqsirə, cinayətə, pis əmələ qarşı tətbiq edilən təsir tədbiri. *Yüksək cəza. Şiddətli cəza. – Güldəstə, sənin cəzan ağır olacaq.* H.Seyidbəyli. ☐ **Cəza almaq** – b a x **cəzalanmaq**. *..Sən üç böyük cinayət etmisən, buna görə cəza alacaqsan.* S.S.Axundov. [Məmmədov:] *Bunun üçün mən lazımi cəza almışam.* H.Seyidbəyli. **Cəza görmək** – cəzalandırılmaq. **Cəza vermək** – b a x **cəzalandırmaq**. *Az qaldı söyləsin, günah işlədin; Sənə cəza verən əməllərindir.* M.Rahim. **Cəzasına yetirmək (çatdırmaq)** – etdiyi cinayətə, təqsirinə görə cəzasını vermək, cəzalandırmaq. [İsgəndər:] *Ay bacı, kaş sağ olaydın, öz gözünlə görəydin ki, sənin namusuna sataşanı necə cəzasına yetirmişəm.* E.Sultanov. [Həsən:] *Əgər ədalət var isə, gərək zalımı cəzasına çatdırsın.* Ə.Haqverdiyev. **Cəzasını almaq** – öz pis əməlinə, etdiyi cinayətə görə cəzaya məruz qalmaq, cəzaya düçar olmaq, cəza çəkmək. **Cəzasını çəkmək** – 1) b a x **cəzasını almaq**; 2) öz qüsurunun və ya ehtiyatsızlığının zərərini çəkmək, altını çəkmək.

◊ **Allah cəzasını versin** – b a x **Allah canını alsın** (“**Allah**”da). **Cəza dəstəsi; cəza ekspedisiyası** – əməkçilərin narazılığını boğmaq və onlara divan tutmaq üçün yaradılan hərbi polis dəstəsi.

**CƏZALANDIRILMA** “Cəzalandırılmaq”dan *f.is.*

**CƏZALANDIRILMAQ** *məch.* Cəza verilmək, cəzaya məhkum edilmək.

**CƏZALANDIRMA** “Cəzalandırmaq”dan *f.is.*

**CƏZALANDIRMAQ** *f.* Cəza vermək, cəzaya məhkum etmək, cəzaya layiq olanın cəzasını həyata keçirmək. [Firəngiz Şahinə:] *Əgər günahının əzabını çəkmisənsə, səni ikinci dəfə cəzalandırmaq insafsızlıq olar.* B.Bayramov.

**CƏZALANMA** “Cəzalanmaq”dan *f.is.*

**CƏZALANMAQ** *f.* Cəza almaq, cəzaya məruz qalmaq.

**CƏZANƏ: cəzanə gəlmək** yaxud **canı cəzana gəlmək –** təngə gəlmək, cana gəlmək, bıqmaq, usanmaq. *Tərlanım sar əlindən, Dərd çəkir xar əlindən. Canım cəzana gəldi; Bivəfa yar əlindən.* (Bayatı). [Şah Mirzə Təqiyə:] *Bəsdir, daha mən cəzana gəldim – hər kəsdə zülm görürsənsə, edam et, çəkdir dara, dağıt zülmü!* C.Cabbarlı. *Qaçaq Nəbinin əlindən Nikolay padşahın canı cəzana gəlmişdi.* S.Rəhimov.

**CƏZAVERİCİ** *is.* Cəzaya məhkum edən, cəzalandıran, cəza vermək məqsədi daşıyan. *Cəzaverici orqanlar.*

**CƏZB** *is.* [*ər.*]: **cəzb etmək** – özünə tərəf çəkmək. *Cins cinsini həmişə cəzb eylər; Yoxdu bu işdə söhbəti-digər.* S.Ə.Şirvani. *Aslanın zirəkliyi, hazırcavablığı, onun alnının genişliyi, bəzən böyüklərə məxsus bir əda ilə dərin fikirlərə getməsi müəllimin diqqətini bir ahənruba kimi özünə cəzb edirdi..* S.Rəhimov; // *məc.* özünü istətmək, heyran etmək, məftun etmək. *Cəzb eyləmə-*

*səydi onu şuri-ləbi-Şirin; Dağlarda külüng çalmaz idi başına Fərhad.* S.Ə.Şirvani. *Gülaranın alma kimi qızarmış yanağı, qaynar bulağa bənzər gözləri ilk baxışdan Musanı cəzb etmişdi.* Ə.Vəliyev.

**CƏZBEDİCİ** *sif.* Cəzb edən, cazibədar, cazibəli, məftunedici. *Cəzbedici gözəllik. Cəzbedici gözlər. – Gəncliyin əlvan tabloları yenə də öz cəzbedici pərdəsini Hüsaməddinin qarşısında açdı.* M.S.Ordubadi. [Nil] *yetişmiş gözəl bir qız kimi cəzbedici idi.* S.Vəliyev.

**CƏZBEDİCİLİK** bax **cazibəlilik**.

**CƏZBETMƏ** *is. fiz.* Cisimlərin biri-birini cəzb etməsindən ibarət fiziki hadisə; cazibə.

**CƏZƏ-FƏZƏ** *is.* [*ər.*] *dan.* Bir şeylə razı olmadığını, etirazını bu və ya başqa hərəkəti ilə bildirmə. [Karvanın adamları] ..*Məmmədə yaxın gəldilər və soruşdular ki, onun bu cəzə-fəzəsinə səbəb nə olubdur?* E.Sultanov. [Cəbi:] *Ağa, belə işdə səbr lazımdır, adamın gərək tədbiri çaşmasın, artıq cəzə-fəzə sizin adınıza layiq deyil.* N.Vəzirov. ☐ **Cəzə-fəzə etmək (eləmək)** – razı olmamaq, müqavimət göstərmək, atılıb-düşmək. [Əliqulu:] *Cəzə-fəzə etmək artıqdır.* S.S.Axundov. [İlyas bəy oğlu Səfiquluya:] *Nə çox dağ-dərə, çox cəzə-fəzə eləsə* [Hürünü] *götür apar, elə yerdə saxla ki, hayına çatan olmasın.* M.İbrahimov.

**CƏZM** *is.* [*ər.*] 1. *köhn.* Kəsmə, qət etmə.

2. Qəti surətdə qərarlaşdırma.

3. Ərəb əlifbasında sükut və hərəkətsizlik əlaməti.

**CƏZİRƏ** [*ər.*] Ada. *Neçə böyük cəzirələr yoxa çıxdı dənizlərdə; Qılınc çalan min bir fateh ad qoymadı heç bu yerdə.* N.Rəfibəyli.

**CIBBILI, CIBCIBBILI** *sif. dan.* Çox balaca, bapbalaca, xırdaca, cıqqılı. .. [Hində] *bala-bala cücələr var, bax belə-belə cıbcıbbılı, ətcəbala.* S.Rəhimov.

**CIBIRIQ** *is.* Qozun üst göy qabığı, yaxud üst göy qabığı çıxarılmış qoz.

◊ **Cıbırığını çıxartmaq** – 1) bərk döymək, əzişdirmək; 2) tamam soymaq, müflis eləmək, var-yoxunu əlindən almaq.

**CIDIR** *is.* 1. At yarışı. *Azərbaycanda cıdırın qədim tarixi var.* ☐ **Cıdıra çıxmaq** – at yarışına çıxmaq, at yarışında iştirak etmək, at çapmaqda yarışmaq. *At minib cıdıra çıxmaq.. qılınc oynatmaq* [Kiçikbəyim] *üçün təbii bir ehtiyac kimi idi.* Çəmənzəminli. [Telli Pərşana:] *Kənd* [Mayanı] *görməmiş, el-oba görməmiş cavan gəlini niyə* [Qaraş] *cıdıra çıxardır?* M.İbrahimov.

2. Minik atlarının yarışı keçirilən yer, meydan. *Cıdır meydanı.*

**CIDIRÇI** *is.* Cıdıra çıxan, cıdırda iştirak edən şəxs. *Gedir düzə çıxanda; O, qulanı çaparaq; Hamı deyir: – Cıdırçı; Olacaqdır bu qoçaq.* M.Dilbazi.

**CIĞ** *is. bot.* 1. Torpağın üstünü basan süpürgəvari ot. [Elçin] *altına cığ tökdü .. özünə rahat yer düzəltdi.* M.Rzaquluzadə.

2. Dənizotu.

**CIĞA** bax **cıqqa** 1-ci mənada. *Yanaşsa üzünə müştaq dəhanlar; Nəfəs dəyər, cığaları yellənər.* Qurbani. *Əsmə, səba yeli, titrəmə çöllər; Cığalar tərpənib tel inciməsin.* Aşıq Abbas. *Çəpkəni hər rəng çalır; Tovuzun cığası kimi.* Aşıq Ələsgər.

**CIĞAL** *sif.* Oyun zamanı oyunun qaydalarını pozmağa və haqsız olduğu halda mübahisə etməyə adət etmiş adam. [Həbibə] *saçı dağınıq, ayaqyalın, arıq, cılız, cığal bir uşaq idi.* Mir Cəlal. *Əvvəllər kənd uşaqları, "xan cığal olar" – deyə,* [Məmmədxanla] *oynamaq istəməsələr də, sonralar razılıq vermişdilər.* P.Makulu.

**CIĞALBAZ** *sif.* [cığal və *fars.* ...baz] Cığallıq etməyi sevən, həmişə cığallıq edən. *Cığalbazı* (*is.*) *oyundan kənar etmək.*

**CIĞALBAZLIQ** *is.* Cığallığı adət etmə, həmişə cığallıq etmə; cığallıq.

**CIĞALLAMA** "Cığallamaq"dan *f.is.*

**CIĞALLAMAQ** *f.* Qəsdən oyunun qaydalarını pozmaq, cığallıq eləmək.

**CIĞALLIQ** *is.* Cığal adamın xasiyyəti, hərəkəti; oyun qaydalarını qəsdən pozma. *Cığallıq eləmək. –* [Səlim Zərnişana:] *Bircə kasa bozbaşına beş tərif deməsəm, hər hikkənə, cığallığına tab gətirməsəm, kasanı adam olanın başına çöndərərdin.* B.Bayramov.

**CIĞARA** [*isp.* cigarra] Siqaret, papiros. *Cığara çəkmək. Cığara qutusu. – Sarışın, həssas baxışlı Şeyda isə cığaranı dumanladaraq, əli alnında düşünüb durur.* H.Cavid. *Əbdül ağa ağac müştükə keçirdiyi barmaq yoğunluqda cığarasını fikirli-fikirli çəkirdi.*

P.Makulu. □ **Cığara kağızı** – çox nazik, zərif kağız, papiros kağızına oxşar kağız. *Bu, zərrəbinlə oxunacaq dərəcədə xırda zərif bir xətt ilə cığara kağızına yazılmış bir məktub idi.* M.Rzaquluzadə. *– Ay kişilər, insafınız olsun, batdıq suyun içində! Belə də qır basarlar? Zalım uşağı elə bil dama cığara kağızı çəkiblər.* "Kirpi".

**CIĞ-BIĞ, CIĞ-VIĞ** Yerbəyerdən çıxan, anlaşılmayan, qarışıq nazik səslər, səs-küy. [Molla Hüsü:] *Bu gün – sabah gözümüzü açıb görəcəyik ki, atasından, anasından bixəbər əcinnələri doldurublar* [məscidə], *cığbığdan qulaq tutulur..* M.İbrahimov.

**CIĞ-CIĞ¹** b a x **cığ-bığ**.

**CIĞ-CIĞ²** *is. zool.* Qağayı cinsindən xırda suquşu, çay-göl qağayısı.

**CIĞCIĞA¹** *is. etnoq.* 1. Gəlin gedən qızların başına salınan qızıl parıltılı bəzək şeyi. *Gəlinin və yengələrin duvaqları aşağı salındı, üzlərinə duvağın üstündən cığcığa taxılmışdı.* Çəmənzəminli. // Bəzək üçün gəlinlərin başına səpilən parıltılı, ala-bəzək pərəklər. *Gəlinin üzünə ağ-sarı pərəklər yapışdırıb, başına parlaq cığcığa tökdüklərindən onun hər tərəfi parıldayırdı.* M.S.Ordubadi.

2. Cığcığa kimi şax şey haqqında. [Hacı Novruz:] *Cığcığa əsginazlar vermişəm, sarı qızıllar sayıb işlətmişəm.* Ə.Haqverdiyev.

**CIĞCIĞA²** *is. bot.* Çiy-çiy yeyilən, yaxud qutabın içinə qoyulan yabanı ot.

**CIĞILDAMA** "Cığıldamaq"dan *f.is.*

**CIĞILDAMAQ** *f.* Cığ-cığ səs çıxarmaq, cığıltı səsi çıxarmaq. *Əlikramın cəhəngləri köpüklənsə də, səsi gücsüz cığıldadı.* B.Bayramov.

**CIĞILDAŞMA** "Cığıldaşmaq"dan *f.is.*

**CIĞILDAŞMAQ** *f.* Cığıltı səsi çıxarmaq. [Nəcəfalı] *ağacın dibindən aralananda ayaqlarını atdıqca qozlar cığıldaşırdı.* B.Bayramov.

**CIĞILTI** *is.* Qoz, fındıq, sərtqabıqlı şeylərin bir-birinə toxunmasından və ya basılıb əzilməsindən hasil olan səs.

**CIĞIR** *is.* 1. Gediş-gəlişdən əmələ gələn ensiz, dar yol. *Evlər, damlar, taxtapuşlar gümüş kimi ağarır; Qar tapdanıb, palçıq olub, dağda cığır qaralır.* A.Səhhət. *İzzət qarı .. Qumru ilə bərabər oba altından keçib, yamacda burulan cığıra düşdü.* Ə.Məmmədxanlı. *Elxan həmin cığırı tapıb, sevincək Oqtayı səslədi..* M.Rzaquluzadə.

2. *məc.* Yol, istiqamət, cərəyan. *İncəsənətdə yeni cığırlar. – Tanıtdı körpələrə; Şanlı sabaha gedən; Cığırları, izləri.* B.Vahabzadə. □ **Cığır açmaq** – 1) istiqamət vermək, yol açmaq; 2) yeni istiqamət (cərəyan) yaratmaq.

3. *məc.* İz, xətt. *Qız cavan idi. Qara saçlarına ağ cığır, girdə, tər sifətinə qırış düşməmişdi.* B.Bayramov. [Məmmədin] *səliqə ilə yana daradığı sıx, qara saçlarında ağ tüklər dolaşıq cığırlar açmış, gicgahları tamam çallaşmışdı.* V.Şıxlı.

◊ **Cığırdan (cığırından) çıxmaq** – b a x **cızığından çıxmaq** (**"cızıq"**da).

**CIĞIRAÇAN** *is. k.t.* Torpaqda cığır açan və səpilən toxumun üstünü torpaqla örtən mexanizm (toxumsəpən və ya əkən maşınlarda).

**CIĞIRDAŞ** *is.* 1. Bir yolla, bir yerdə gedən; yoldaş.

2. *məc.* Müvəqqəti olaraq, ya da zahirən hər hansı ictimai-siyasi hərəkata qoşulan, onunla ayaq-ayaq gedən adam. *İnqilab cığırdaşları. Proletar ədəbiyyatı cığırdaşları.*

**CIĞLANDIRMA** "Cığlandırmaq"dan *f.is.*

**CIĞLANDIRMAQ** *f.* Ütmək, üzdən yandırmaq, qarsalamaq.

**CIĞLANMA** "Cığlanmaq"dan *f.is.*

**CIĞLANMAQ** *f.* Ütülmək, üzdən yanmaq.

**CIĞLIQ** *is.* Çoxlu cığ olan, cığ basmış yer.

**CIQQ** *is.* Güllə səsi. *Hər yaraqlanıb döyüşə çıxan, öldürəcəyəm deyən, bir də görürsən ki, cıqq eləmədən öldürüldü, düzə atıldı!* S.Rəhimov.

**CIQQA** *is.* [*fars.*] 1. Başın ön və yan tərəfinə tökülən tellər. *Siyah zülfü dal gərdəndə bir qulac! Sona cıqqasıtək ucları qıyğac.* Q.Zakir. *Gülab qoxusu şairi nəşələndirdi. Xoş bir təbəssümlə şagirdini süzdü: cıqqa telləri ağ cunadan çıxıb gərdəninə toplanmışdı.* Çəmənzəminli.

2. Tacşəkilli, daş-qaşlı qadın başlığı. [Ərən:] *Xanım yürüdükcə cıqqasının ziqiymət qaşları minbir rəng çalırdı.* Çəmənzəminli. *Cüftilə alınmış brilyant sırğa; Minalı*

*bilərzik, almazlı cıqqa.* H.K.Sanılı. *Cıqqanın ortasında quş yumurtası böyüklüyündə üç ..qiymətli daş parlayırdı.* M.S.Ordubadi.

**CIQQALI** *sif.* Cıqqa taxmış, başında cıqqa olan.

**CIQQILI** bax **cıbbılı**. *Cıqqılı sırğa. Cıqqılı üzük. – Ələmdar gördü ki, bir nazlı xanım xeyli qızıl sayıb bu daş-qaşdan tək bircə cıqqılısını alır..* S.Rəhimov.

**CIQQILTI** *is.* Ağac sınarkən çıxan səs. *Budağın cıqqıltısı gəldi.*

**CIQQIR: cıqqır çıxmamaq** – qətiyyən səs çıxmamaq, susmaq. [Müqim bəy:] *Mən böyük olan mahalda gərək alt-üst bir cıqqır çıxmasın, lələ!* S.Rəhimov. **Cıqqırını çıxarmamaq (çəkməmək)** – heç dinməmək, qətiyyən səsini çıxartmamaq, susmaq. *Qır döşəmə üzərinə yıxılmış qoca isə cıqqırını çıxarmayırdı.* Ə.Məmmədxanlı.

**CIQQIRIQ** bax **cıqqır**.

**CILDIR-CILDIR** bax **gildir-gildir**.

**CILFIR** *sif. dan.* Qeyri-ciddi, hər işə yüngül yanaşan, səthi düşünən, danışığını bilməyən, bambılı. *Cılfır adam.*

**CILXA** *sif.* Xalis, səlt. *Ət cılxa yağdır.* // Qatışıqsız, qarışıqsız. *Cılxa süd.*

**CILXACA** bax **cılxa**. [Gülnisə:] *Ana, südlü yaymanı cılxaca süddən bişirim, yoxsa su da qatışdırım?* Ə.Haqverdiyev.

**CILIZ** *sif.* 1. Çox arıq, balaca, zəif, sısqa, cansız, ölüvay. *Cılız uşaq. Cılız qız. – ..Müstəntiq arıq, cılız çiyinlərini çəkəçəkə, təlaşla içəri girib əlindəki böyük qovluğu stolun üstünə qoymamış, prokuroru ayıq saldı.* M.Hüseyn. *Bütün görkəminin cılız olmasına baxmayaraq, bu adamın mis kimi cingildəyən çox möhkəm səsi.. vardı.* Ə.Əbülhəsən. [Elxanın oğlunun] *yanında balacaboy, cılız müşavirdən başqa on atlı da vardı.* P.Makulu.

2. *məc.* İnkişaf etməmiş, boy atmamış, zəif. *Cılız pambıq kolları. – ..Təbiət sanki qəsdən bir az uzaqda xəstə və cılız qol-qanadlı, küskün budaqlı iki-uç söyüd ağacı yaratmışdı.* A.Şaiq.

**CILIZLANMA** "Cılızlanmaq"dan *f.is.*

**CILIZLANMAQ** bax **cılızlaşmaq**.

**CILIZLAŞMA** "Cılızlaşmaq"dan *f.is.*

**CILIZLAŞMAQ** *f.* Get-gedə balacalaşmaq, cılız olmaq, sısqalaşmaq. *Uşaq lap cılızlaşıb.* // *məc.* Əvvəlki keyfiyyətini, sanbalını itirmək.

**CILIZLIQ** *sif.* Cılız olma; cılız adamın, şeyin halı; sısqalıq. *Cılızlığından uşağın yaşı bilinmir.*

**CINAQ** *is.* Kürəklə döş qəfəsini birləşdirən sümük. *Səbirlə hər şeyi öyrənmək olar, – deyə, Yusif tüfəngi cınağına alıb qabağa düşdü.* B.Bayramov.

**CINAQLI** *sif.* Kürəkli, sümüklü, şaqqalı. *Cınaqlı oğlan.* – [Xanməmməd:] [Səfər] *iyirmi-iyirmi iki yaşında olar, amma zalım cınaqlı şeydir.* Çəmənzəminli.

**CINDA** *is. dan.* 1. Əxlaqsız, pozğun qadın.

2. Bax **cındır**. *Cavahir cında içində olar.* (Ata. sözü).

**CINDIR** *sif.* Tamam köhnəlib yaramaz hala gəlmiş, cırıq-cırıq olmuş, geyilməsi qalmayan, yıpranmış. *Dilənçi, qoltuğundakı köhnə paltarı ki, ona Allah payı vermişdilər, Nurəddinə geyindirdi və bir cındır yaylıqla başını örtdü.* S.S.Axundov. [Toxucuların] *əksəriyyəti .. cındır çit çadralara bürünmüş qadınlar idi.* Ə.Məmmədxanlı. // *is. mənasında.* Əsgi parçası, yıpranmış, yırtılmış, cındır hala gəlmiş paltar və s.

◊ **Cındırından cin hürkür** – üst-başı tamam tökülmüş, cın-cındır geyinmiş adam haqqında. *Gözünə girsin, .. o vaxt cındırından cin hürkürdü, indi forma geyib nəçərnik olmusan.* S.Rəhimov.

**CINDIRÇI** *is.* İşə yaramayan, köhnəkürüş, yıpranmış pal-paltarı və s. yığıb satmaqla məşğul olan adam.

**CINDIRLAŞMA** "Cındırlaşmaq"dan *f.is.*

**CINDIRLAŞMAQ** *f.* Çox işlənməkdən, geyilməkdən tamamilə yararsız hala gəlmək, cırılmaq, yırtılıb-dağılmaq, yıpranmaq. *Üstbaşı lap cındırlaşıb.*

**CINDIRLI** *sif.* Üst-başı cındır olan. *Cındırlı adam.*

**CINDIR-MINDIR** *top. dan.* Cındır-cındır olmuş, dağılmış pal-paltar və s. // Əsgi-üsgü. *Cındır-mındırı yığıb atmaq.*

**CINQ, CINQ-CINQ** bax **cınqıltı**.

**CINQILDAMA** "Cınqıldamaq"dan *f.is.*

**CINQILDAMAQ** *f.* Cınqıltı çıxarmaq, cınqıltı səsi çıxarmaq, cınq-cınq eləmək.

**CINQILDATMA** "Cınqıldatmaq"dan *f.is.*

**CINQILDATMAQ** *f.* Cınqıltı səsi çıxartmaq. *Qabları bir-birinə vurub cınqıldatmaq. Xırda pulları cınqıldatmaq.*

**CINQILI** b a x **cumbulu**.

**CINQILTI** *is.* Dəmir və b. metal şeyin başqa bir şeyə və ya bir-birinə toxunarkən çıxardığı səs. *Zəncir cınqıltısı.* – [Məşədi Səttar:] *Cibində pulun cınqıltısını eşidib dedi ki, gərək gedib, ağanı ziyarət eləyəm.* Ə.Haqverdiyev. Səs *yox idi, qəlyanların səsi, çay qaşıqlarının cınqıltısı da susmuşdu.* M.S.Ordubadi.

**CINQIR** b a x **cıqqır**.

◊ **Cınqırını çıxarmamaq (çəkməmək)** – b a x **cıqqırını çıxarmamaq ("cıqqır"**da). *Nə həyətdə, nə də dəhlizdə cınqırını çəkən vardı.* M.S.Ordubadi. *Bütün sinif cınqırını çıxarmırdı.* Ə.Əbülhəsən.

**CINQIROV** b a x **zınqırov**.

**CIR** *sif.* 1. İnsan əli ilə deyil, təbii şəraitdə, öz-özünə bitən. *Cır ağac.* – [Yusif aqronoma:] *Meyvə bağı deyiləndə, bax, bu çayın qaşındakı iyirmi-otuz cır alma-armud ağacıdır.* B.Bayramov. *Bizim cır alçanın gülləri kimi; Yerin sinəsinə səpələnir qar.* Ə.Kürçaylı.

2. *məc.* Nazik və qıcıqlandırıcı. *Ə, topal ha deyilsən! – deyə, pərt olmuş Əlləzoğlu cır səslə arvadına təpindi.* İ.Hüseynov.

3. *məc.* Tez hirslənən, tez özündən çıxan, kəmhövsələ, tünd. *Çox cır adamdır.*

**CIR-CINDA** b a x **cır-cındır**. [Kərbəlayı Eyvaz Dürnisəyə:] *Dur, cır-cındanı yığ, gedək qazının yanına, səni boşuyuram.* Çəmənzəminli. *Üst-başından çəkmə mazı və cır-cında iyi gələn yekəpər bir kişi içəri girdi.* H.Seyidbəyli.

**CIR-CINDIR** b a x **cındır-mındır**. ..*Qapıdan cır-cındır içində, saqqal-bığ basmış bir adam girdi.* Çəmənzəminli. ..[Mahmudun] *başına qoyduğu çalma isə cır-cındırdan olurdu.* S.Vəliyev.

**CIRCIRAMA** *is. zool.* Əlvan qanadları uçarkən cır-cır səsi verən uzungövdəli cücü. *Cırcırama yaz, bahar; Nəğmə oxur biqərar.* A.Səhhət. *Xoş sükut içində yalnız cırcıramaların aramsız, yeknəsəq səsi eşidilirdi.* İ.Əfəndiyev. ☐ **Yayın cırcıramasında** – yayın ən isti çağında. [Çiçək:] *Bilmirəm yayın cırcıramasında bu nə kurs idi?* B.Bayramov.

**CIRDIRMA** "Cırdırmaq"dan *f.is.*

**CIRDIRMAQ** *icb.* Cırmağa məcbur (vadar) etmək. *Kağızı cırdırmaq.*

**CIRHACI** *is. məh.* Şirin qırmızı alma növü.

**CIRHACIR** 1. *təql.* Aramsız çıxan cırıltı səsi haqqında. *Külək vurduqca quru ağac cırhacır səslənir.* – [Zərrintac] *tez-tez başını qaldırıb, axşamdan yola salınan meyvə arabalarının dolama yolla necə cırhacırla* (z.) *çıxdığına tamaşa edirdi. S.Rəhimov*.

2. Bərk yandırıcı, qızmar hava haqqında. *Yayın cırhacırı idi.*

**CIRIQ** *sif.* 1. Bir və ya çox yerdən cırılmış, yırtılmış, parça-parça olmuş; yırtıq. *Cırıq paltar. Cırıq çəkmə. Cırıq örpək.* – [Nənəxanım] *bir də geri qayıtdı, əsnəyə-əsnəyə dalına bir çirkli və cırıq yorğan salıb oturdu.* Çəmənzəminli. [Dərviş:] *Ruqiyyə bir köhnə keçə üstündə, bir köhnə cırıq kilimdə yatırdı.* A.Divanbəyoğlu. // *is.* Cırılmış, sökülmüş, yırtılmış yer. *Köynəyin cırığını tikmək.*

2. Bitişmiş yara yeri.

**CIRIQ-CIRIQ** *sif.* Tamam cırıq, hər yeri cırıq. *Cırıq-cırıq dəftərlər.* // Zərf mənasında. *Kitabı cırıq-cırıq eləmək.*

**CIRILDAMA** "Cırıldamaq"dan *f.is.*

**CIRILDAMAQ** *f.* Cırıltı səsi çıxarmaq, cırcır eləmək. *Arabanın yağlanmamış təkəri cırıldadığından Tərlan qabaqda gedən oğlanın cavabını eşidə bilmədi.* M.Hüseyn. *On beş gündü ki, Cəmilin kasıb daxmasının qapısı cırıldamırdı.* Mir Cəlal. ..*Pəncərənin qabağında pilləkənin taxtaları ara-sıra cırıldayırdı.* İ.Hüseynov. // Cırcırama haqqında. *Cırcırama cırıldayır.* // Cırıltılı səs çıxarmaq. *Nadir Səfərəli müəllimin sualına yavaş, titrək səslə cavab verdi: – Yaxşı müəllim. – Yox, bu olmadı. Səsin cırıldayır.* M.İbrahimov.

**CIRILDAŞMA** "Cırıldaşmaq"dan *f.is.*

**CIRILDAŞMAQ** *qarş.* Bir yerdə ağız-ağıza verib cır-cır səs çıxartmaq, cırıldamaq. *Qarğa kimi çox da qığıldaşmayın! Ay cücələr, bəsdi, cırıldaşmayın!* Ə.Nəzmi. ..*Suyu qurumuş arxın üstündəki söyüd ağacında cırcıramalar cırıldaşırdı.* B.Bayramov.

**CIRILDATMA** "Cırıldatmaq"dan *f.is.*

**CIRILDATMAQ** *icb.* Cırıldamasına səbəb olmaq, cır-cır səs çıxartdırmaq. *Sübhanverdizadə eşələnərək məftilli krovatı cırıldatdı.* S.Rəhimov. *Seyid qamış qələmi cızıqlı kağız üzərində cırıldadaraq kəşidə xətlə Tahirzadəyə şəhadətnamə yazdı.* Mir Cəlal.

**CIRILĞAN** *sif.* Tez cırılan, tez dağılan, davamsız. *Cırılğan parça.*

**CIRILĞANLIQ** *is.* Cırılğan şeyin keyfiyyəti.

**CIRILMA** "Cırılmaq"dan *f.is.*

**CIRILMAQ** *f.* 1. Daralmaqdan, çəkilməkdən və ya çox işlənib köhnəlməkdən yıpranmaq, üzülmək, didilmək, kəsilmək. *Paltarı cırılmaq. Köynəyin qolu cırılmışdır. – Çürümüş parçanın dəxi faydası yoxdur. Bir yandan yamadın, o biri yandan cırılacaq.* C.Məmmədquluzadə. [Qarakişi Nəcəfalıya:] *Yorğanı dartarsan cırılar, amma ayağını qarnına yığa bilərsən.* B.Bayramov.

2. Parçalanmaq, partlamaq. *Xülasə, Şükür çomağı götürüb çəpərdən keçdi və çatan kimi elə vurdu ki, Kazımın başı qarpız tək cırıldı.* Çəmənzəminli.

**CIRILTI** *is.* Cır-cır səsi; qıcırtı. *Çarpayının cırıltısı. – Furqon astaca cırıldayırdı. Bu cırıltı Quluya xoş gəlmirdi.* M.İbrahimov. *Zınqırovlu faytonda heç kəs dinib-danışmır, yer-yurdu bürüyən duman-çiskində ancaq Topuşun səsi, bir də təkərlərin aramsız cırıltısı eşidilirdi.* S.Rəhimov.

**CIRILTILI** *sif.* Cırıltı səsi verən, cırıldayan. *Cırıltılı səs.*

**CIRIM-CINDIR** b a x **cır-cındır**. *Altımızda xalı deyil, cırım-cındır həsirdir; Ləmədəsə rəngi uçmuş beş-on nimçə, kasa var.* S.Rüstəm. [Yəhya Kamal:] *Paltarı desən, yaxşı, cırım-cındır gəzərəm. Yeməyi deyirsən, xəlvətdə! Ancaq ki arvadsız işim keçmir.* Mir Cəlal.

**CIRIM-CIRIM** b a x **cırıq-cırıq**.

**CIRINQ-CIRINQ** *təql.* Saxsı qab-qacaq sınarkən çıxan səs.

**CIRINQHACIRINQ** *zərf* Cırınqıltı ilə, cırınq-cırınq səs çıxararaq. *Cırınqhacırınq qablar yerə töküldü.*

**CIRINQILTI** b a x **cınqıltı**.

**CIRQURSAQ** b a x **cırtqoz**.

**CIRQURSAQLIQ** b a x **cırtqozluq**.

**CIRLAMA** "Cırlamaq"dan *f.is.*

**CIRLAMAQ** *f.* Bir şeydən, söhbətdən, zarafatdan və s.-dən tez inciyib pozulmaq, pərt olmaq, xoşlanmamaq.

**CIRLAŞMA** "Cırlaşmaq"dan *f.is.*

**CIRLAŞMAQ** *f.* Nəsli pozulmaq, cinsi pozulmaq, pisləşmək. *Əməksiz, insansız bir iş görmədi; Ağaclar cırlaşdı, meyvə vermədi.* M.Dilbazi. *Təcrübə göstərir ki, zeytun ağaclarına pis baxıldıqda meyvələri cırlaşır.* İ.Axundzadə. // *məc.* Əvvəlki keyfiyyətini, dəyərini, gözəlliyini və s.-ni itirmək; pisləşmək.

**CIRLIQ** *is.* 1. Cır ağac və ya kollar basmış yer. *Cırlıq, kör-kötük basmış yerləri* [Rüstəm kişi] *təmizləməyə girişdi.* M.İbrahimov.

2. *məc.* Əvvəlki keyfiyyətini itirmə, əsli, cinsi pozulma, vəhşiləşmə.

**CIRMA** "Cırmaq"dan *f.is.*

**CIRMAQ[1]** *f.* 1. Kağız, parça kimi şeyləri qıraqlarından dartaraq parça-parça, doğram-doğram etmək. [Banıxanım:] *Oğul, bu nə gündür düşübsən, sənin üst-başını kim cırmışdır?* "Aşıq Qərib". *Gəray deyilən sözü eşitmir, verilən dərsi əzbərləmir, fərşlərin üstündə yumbalanır, dəftər-kitabını cırır, əl-ayaq altına atırdı.* S.Rəhimov. *Külək* [Dürrənin] *getməsinə mane olub paltarını sanki cırmaq istəyirdi..* S.Vəliyev.

2. Cırmaqlamaq. *Üzünü cırmaq.*

3. *məc. dan.* Gizlicə qaçmaq, götürülmək. *Qonaqlar ev sahibi ilə.. gülüşdükdə uşaq börkünü başına qoyub, yavaşca otaqdan "cırdı".* Çəmənzəminli. [Yəhya Kamal Dilənə:] [Kişi] *bir günün içində hökuməti kəndə tökdü. Mən gecə bağların içindən cırdım.* Mir Cəlal.

**CIRMAQ[2]** b a x **caynaq**.

**CIRMAQLAMA** "Cırmaqlamaq"dan *f.is.*

**CIRMAQLAMAQ** *f.* Cırmaq atmaq, dırnağı ilə dərisini qopartmaq. [Murtuz:] *Axı pişiyi dara qısnarsan, qayıdıb adamın üzünü cırmaqlar.* Ə.Abbasquluyev. *Əbiş paketi görər-görməz vəhşi bir hərəkətlə onun əlini cırmaqlayıb paketi çaldı..* S.Rəhimov.

◊ **Bir-birini cırmaqlamaq** – bir-birilə dalaşmaq, yola getməmək, cırmaqlaşmaq. *Bir az bir-birimizi cırmaqlayandan və kötəkləyəndən sonra bir də gördüm ki, bir qoca kişinin qucağındayam.* C.Məmmədquluzadə.

**CIRMAQLAŞMA** "Cırmaqlaşmaq"dan *f.is.*

**CIRMAQLAŞMAQ** *qarş.* Bir-birinə cırmaq atmaq, bir-birini cırmaqlamaq. *Uşaqlar cırmaqlaşdılar.*

**CIRNAQ** b a x **caynaq**.

**CIRNAMA** "Cırnamaq"dan *f.is.*

**CIRNAMAQ** *f.* Zarafat götürməyərək və ya başqa bir şeydən qızışmaq, hirslənmək, özündən çıxmaq. *Zarafatdan cırnamaq.* – *..Elə ki birinin zarafatdan acığı gəldiyini, cırnadığını gördü, o adamın yaxasından əl çəkməzdi.* V.Şıxlı. // Çəkilmək, acizlik göstərmək, acizliyini boynuna almaq.

**CIRNATMA** "Cırnatmaq"dan *f.is.*

**CIRNATMAQ** *f.* Qəsdən hirsləndirmək, acıqlandırmaq; özündən çıxartmaq.

**CIRT¹** *is.* Quru ağacı sındırdıqda çıxan səs.

**CIRT²** b a x **çırt**.

**CIRTDAN** *is.* 1. Çox xırda adam. *Telli də boy atmayır; Cırtdandan balacadır; Yaşıdı Sənəm ondan; Həm sağlam, həm ucadır.* M.Dilbazi. *Bir də görürsən ki, dağ boyda insan; Bir cırtdan önündə cücədir, cücə.* B.Vahabzadə. [Güllü xanım:] *..Eynşteyn deyib ki, cırtdanı nəhəngin başına mindirsən də ondan nəhəng çıxmaz..* B.Bayramov. // *sif. mənasında.* Çox kiçik, cılız, sısqa. *Əlləzoğlu cırtdan gövdəsini çəkib, bu iri qol-budaqlı adamın qarşısında özünü yığışdırdı.* İ.Hüseynov.

2. *məc.* Naçiz, dəyərsiz, ləyaqətsiz adam haqqında. [Kərəmov:] *Adamlığı, qabiliyyəti etibarilə cırtdan olduğu halda, özünü aslan hesab edir.* İ.Əfəndiyev.

**CIRTDANBOYLU** *sif.* Boyu çox balaca, kiçik, xırda. *Cırtdanboylu uşaq.*

**CIRTDANLIQ** *is.* Həddən artıq balacalıq, kiçiklik, xırdalıq.

**CIRTQOZ** *is. dan. zar.* Tez hirslənən, tez özündən çıxan, yüngül və qeyri-ciddi adam haqqında. *Cırtqozun biridir.*

**CIRTQOZLUQ** *is. dan. zar.* Tez hirslənmə, tez özündən çıxma; cırtqoz adamın xasiyyəti.

**CIVILDAMA** "Cıvıldamaq"dan *f.is.*

**CIVILDAMAQ** *f.* Cıv-cıv, civilti səsi çıxarmaq (kiçik quşlar, cücələr haqqında).

**CIVILDAŞMA** "Cıvıldaşmaq"dan *f.is.*

**CIVILDAŞMAQ** *qarş.* Hamısı bir yerdə, səs-səsə verib cıvıldamaq. *Bunca qabağında cıvıldaşmayın! Ey cücələr, çox da cırıldaşmayın!* Ə.Nəzmi.

**CIVILDIZ** *is. məh.* Diribaş. burdan batıb ordan çıxan, zirək. *Cıvıldızın biridir.*

**CIVILTI** *is. təql.* Cücələrin, kiçik quşların çıxardığı cıv-cıv səsi. *Quşlar, o fərəhbəxş cıvıltilə həvadə; Öz lanələri səmtinə eylərlər iradə.* A.Səhhət. *Bəzən cıvıltı ilə yerdən qalxıb havanı qaraldan sığırçın sürüləri dəli atları səksəndirib, yoldan kənara çıxarırdı.* M.Hüseyn.

**CIVRIQ** *sif.* Çox diribaş, çevik, cəld, zirək. *Cıvrıq uşaq.*

**CIVRIQLIQ** *is.* Çox çeviklik, diribaşlıq, zirəklik, cəldlik.

**CIZ¹, CIZZ** *təql. uş.* Od, yandırıcı şey. *Cızz, əl vurma!* // Ət kimi şeylərin yağda qızararkən, ya yanarkən çıxardığı səsi anladır.

**CIZ²** b a x **cızıq**. [Bədircahan:] *..Başın üçün, xan! Bu cızlardan yüz iyirmi iki görünür.* N.Vəzirov.

**CIZBIZ** *is.* İçqovurması. *..Leylək bir qədər gedəndən sonra cızbız iyi aldı.* S.Rəhimov. *Bir tərəfdə cızbız, bir tərəfdə çay; Alma, heyva, armud, soğan, vəzəri; Bir tərəfdə xalı, tirmə, kəlağay; Baqqallar qışqırır: "Gəl, ay müştəri!".* H.Hüseynzadə.

**CIZBIZÇI** *is.* Cızbız bişirib satan adam.

**CIZBIZXANA** *is.* Cızbız bişirilib satılan yer.

**CIZDAQ** *is.* Quyruq əridildikdən sonra qalan bərk hissələri. *Xəmirə cızdaq qatmaq.*

**CIZHACIZ** *zərf* Qovrula-qovrula, cızıldaya-cızıldaya. *Feyzi içqovurmasını teştdə cızhacız gətirdi..* B.Bayramov.

◊ **Cızhacız yanmaq** – bərk acıq çəkmək, yanıb tökülmək. *Mədəd hirsindən cızhacız yanır, içəridən qıvrıla-qıvrıla qalırdı.* Ə.Vəliyev.

**CIZIQ** *is.* Xətt. [Veys] *..dönüb gücənə-gücənə divara dikinə yanaşı üç cızıq, köndələninə yanaşı iki cızıq çəkdi.* Ə.Əbülhəsən. *Sultan ayağa qalxanda kreslonu elə qəzəblə itələdi ki, parket döşəmədə ağ qoşa cızıqlar düşdü.* İ.Hüseynov.

◊ **Cızığından çıxmaq** – həddini aşmaq, qudurmaq, cığırından çıxmaq. *Necədi, əzizim! Bir də məni təngə gətirərsən? Bir də cızığından çıxarsan?* C.Məmmədquluzadə. **Cızığını aşmaq** – b a x **cızığından çıxmaq**.

**CIZIQ-CIZIQ** *sif.* və *zərf* Cızılmış, cızıqlar çəkilmiş. *Kitabın üstü cızıq-cızıqdır. – Qaraş otağın ortasındakı yanları yonulub cızıq-cızıq olmuş stolun baş tərəfində qoyulmuş katilə əyləşdi.* M.İbrahimov.

**CIZIQLAMA** "Cızıqlamaq"dan *f.is.*

**CIZIQLAMAQ** *f.* Cızıq çəkmək, xətt çəkmək. // *məc.* Cızma-qaralamaq, yazmaq. [Səlim Zərnişana:] *Mənim heykəlim, başımın ucalığı balalarımdır, bir də bax bu mürəkkəblədiyim, cızıqladığım kağızlardır.* B.Bayramov.

**CIZIQLANMA** "Cızıqlanmaq"dan *f.is.*

**CIZIQLANMAQ** *məch.* Cızıq çəkilmək.

**CIZIQLI** *sif.* Cızıqlar çəkilmiş, cızıqları olan, miləmil. *Cızıqlı dəftər. – Mirzə oturub, cızıqlı kağızı çıxardı.* S.Rəhimov. *Seyid qamış qələmi cızıqlı kağız üzərində cırıldadaraq.. Tahirzadəyə şəhadətnamə yazdı.* Mir Cəlal.

**CIZILDAMA** "Cızıldamaq"dan *f.is.*

**CIZILDAMAQ** *f.* Cız-cız eləmək, cızıltı səsi çıxartmaq. *Pavluşa əlini alnına çəkdi, tər qızarmış dəmirin üstünə tökülərək cızıldadı.* M.S.Ordubadi. *..Yağ əridikcə közün üstünə damcılayıb cızıldayır, seyrək tüstü qalxıb sakit havada yayılır, həyati kabab iyi bürüyürdü.* İ.Hüseynov.

**CIZILTI** *is.* Od və ya qızğın şey üstünə düşən yağ, su və s.-dən hasil olan səs. *Kababın cızıltısı. Yağın cızıltısı. – Közün üstünə düzülmüş göbələklərin cızıltısından özgə səssəda eşidilmədi.* B.Bayramov.

**CIZMA** "Cızmaq"dan *f.is.*

**CIZMAQ** *f.* 1. Xətt, cızıq çəkmək; dırnağı və başqa bərk, ucu iti bir şeylə basaraq iz buraxmaq. *Xəlil döş cibindən qələmini çıxardıb, katibin dırnağı ilə cızdığı yerdən imzasını atdı.* M.Hüseyn.

2. Qaralama şəklində yazmaq, çəkmək, hazırlamaq. *Həsrət cızdığı planlar barədə əvvəlcə Yusiflə, Daşdəmirlə .. məsləhətləşmək istədi.* B.Bayramov.

3. Siyirmək, dərisini qopartmaq. *Ağac qolunu cızıb. Tikan əlimi cızdı.* // Cırmaqlamaq, cırmaq, cızıq-cızıq eləmək.

4. *məc.* Düşünmək, düzəltmək. *Plan cızmaq.*

**CIZMA-QARA** *is.* Aydın oxunmayan, səliqəsiz, qarışıq yazı. O, *dəftər cildində yazdığı cızma-qaranı Xəlilə uzatdı: – Budur, bax, yazmışam.* M.Hüseyn. // *isteh.* Lüzumsuz, faydasız, mənasız yazı. ☐ **Cızma-qara etmək (eləmək)** – səliqəsiz, tələsik, qarışıq xətlə yazmaq, qaralamaq. *Meşinov qələmlə yaza bilmədiyindən, məlumatların hamısını karandaşla cızma-qara edər*(*di*).. S.Rəhimov. // Faydasız, mənasız yazı ilə məşğul olmaq. *Piri oturub cızma-qara edə-edə başını qarışdırırdı.* M.Süleymanov.

**CIZMA-QARAÇI** *is.* Cızma-qara yazmaqla məşğul olan adam.

**CIZMA-QARALAMA** "Cızma"-qaralamaqdan *f.is.*

**CIZMA-QARALAMAQ** *f.* Səliqəsiz, necəgəldi, tələsik yazmaq və ya çəkmək (şəkil). *Ancaq məni xarab .. iş o idi ki, hər nə işə gedirdimsə, gərək bir yekə kağız əlimə alıb, hekayədən, nağıldan cızma-qaralayaydım.* C.Məmmədquluzadə.

**CIZMALAMA** "Cızmalamaq"dan *f.is.*

**CIZMALAMAQ** b a x **cızmaq** 1-ci mənada.

**CİB** *is.* 1. Pul və başqa xırda şeylər qoymaq üçün paltara üst və iç tərəfdən tikilən kisəcik. *Pencəyin yan cibləri. – Məhəmmədhəsən əmi təzədən kisəni cibindən çıxarıb məşğul oldu çubuğu doldurmağa..* C.Məmmədquluzadə. *Yükdaşıyan çamadanı yerə qoyanda Əziz əlini cibinə saldı.* S.Rəhman.

2. Portfeldə, çamadanda və s.-də ayrıca bölmə, göz.

3. Cibə qoyulan, cibdə gəzdirilən. *Cib bıçağı. Cib saatı. Cib dəftəri. – Bu xonçada olar .. bir cift əla tufli, corab, ənlik, rasıq daşı və mazı, iki kisə xına, cib güzgüsü, qayçı.* R.Əfəndiyev. *Mirzə Cəmil cib dəsmalını çıxarıb gözlərini silə-silə dilləndi..* Ə.Vəliyev.

◊ **Cibə zərər vurmaq** – çoxlu pul xərcləməyə, maddi zərər çəkməyə məcbur olmaq (ya etmək). **Cibində siçan (yel) oynayır** – cibində pulu olmayan adam haqqında. **Cibinə (cibimə) görə deyil** – birinin imkanına görə çox baha şey haqqında. **Cibinə əl atmaq** – səxavətə gəlmək. **Cibinə qoymaq** – mənimsəmək, cibləmək, özü üçün götürmək.

[Qaçaq Nəbi] *..fəqir kəndlilərin töycülərini özlərinə qaytarıb, zənginlərin töycüsünü cibinə qoyurdu.* E.Sultanov. **Cibini boşaltmaq** – bütün pullarını xərclətmək, ya xərcləməli olmaq. **Cibini doldurmaq** – 1) qeyri-qanuni yolla varlanmaq; 2) başqasını varlandırmaq, dövlətləndirmək. *A kişi, özgə xərclər dursun kənarda, təkcə ağanın cibini doldurmaq olmur.* Ə.Haqverdiyev. **Cibini kəsmək** – cibindəki pulunu oğurlamaq. *Bazarda Mollanın cibini kəsirlər.* "M. N. lətif.". **(Öz) cibini güdmək** – ancaq öz xeyrini, öz mənfəətini güdmək. [Barat Allahverdiyə:] *Bunlar hamısı elə adamların işidir ki, öz ciblərini güdürlər.* C.Cabbarlı. **Cibinin ağzını (geniş) açmaq (boş qoymaq)** – səxavət göstərmək, çoxlu pul xərcləmək, ya xərcləməyə hazır olmaq. **Cibinin ağzını sökmək** – b a x **cibinin ağzını (geniş) açmaq**. **…büküb cibinə qoymaq –** birinin başqasından (ya başqalarından) daha zirək, daha bic, yaxud daha bilikli olduğunu bildirir.

**CİBBİLTİ** b a x **civilti**. *Cücələrin cibbiltisi.*

**CİB-CİB** *təql.* Toyuq, xoruz və cücələri çağırmaq üçün çıxarılan səs. *Ovcunu dənlə doldurub cib-cib eləmək.*

**CİBCİK** *is.* Balaca cib. *Pencəyin cibciyi.*

**CİBƏGİRƏN** b a x **cibgir**.

**CİBGİR** *is.* Cib oğrusu, cibə girən oğru, xəspuş. *Yoxdu pul qədri bilən dəhrdə cibgir kimi.* M.Möcüz. *Cəfərqulu bir qədər çəkindi. Ona demişlərdi ki, "şəhər yerində cibgir çox olar, özünü gözlə".* Qantəmir. *Xuliqanlar və cibgirlər dəstəsi qoyun sürüsü kimi durub irəliləməkdən qorxurdu.* M.Hüseyn.

**CİBGİRLİK** *is.* Cibgirin peşəsi, cibə girməklə məşğul olma; xəspuşluq.

**CİBXƏRCLİYİ** *is.* Gündəlik xırda xərc üçün ayrılan, verilən pul. [Mirzədadaş:] *..Hətta mən ondan otuzca manat cibxərcliyi alaram.* N.Vəzirov. *Həsən molla üçün bir az cibxərcliyi saxladı, qalanını da döşəyinin altında gizlətdi..* S.Rəhman.

**CİBİŞDAN** *zar.* "Cib" 1-ci mənada.

◊ **Cibişdana qoymaq (ötürmək)** – b a x **cibinə qoymaq ("cib"**də).

**CİBKƏSƏN** *is.* Cibgir, oğru, soyğunçu. [Paşa:] *Adları bəy, özləri cibkəsənlər, dəlləklər, quldurlar!..* N.Vəzirov. *Talayır adam göz baxa-baxa; Bu yeni cibkəsən, bu yeni oğru.* B.Vahabzadə.

**CİBLƏMƏ** "Cibləmək"dən *f.is.*

**CİBLƏMƏK** *f.* Başqasının pulunu mənimsəmək, cibinə ötürmək. *Kimin ixtiyarı var, mənim pulumu cibləsin. Alnımın təri ilə qazanmışam.* M.Hüseyn. *..Məlumdur ki, həmin pulu uşaq almayıb, kim isə başqası cibləyibdir.* "Kirpi".

**CİBLİ** *sif.* Cibi, ya cibləri olan, cib tikilmiş, cib qoyulmuş. *Cibli pencək. Cibli xalat.* – *Əksərən .. cibli köynək geyərək belini qayışla bərkitmiş kişilər arabanın yan tərəflərinə doluşmuş(dular).* M.İbrahimov. // *məc.* Varlı, dövlətli mənasında. *Cibli adamdır.*

**CİBLİK** *is.* Cib tikməyə ayrılan parça. // Sif. mənasında. *Ciblik parça.*

**CİCİ[1]** *is.* Bəzi yerlərdə nəvazişlə anaya deyilir. *..Bunlar məgər təzə sözdür? Bunu cicim də bilir.* "Mol. Nəsr.". *Bir də bilirsən nə var, Güldanə, hamar yolla getməyə nə var, cicim də gedər.* Ə.Vəliyev.

**CİCİ[2]** *is. uş.* Uşağın xoşuna gələn şey. *Ana sənə cici gətirib.*

**CİCİ-BACI** *is. dan.* Bir-birinə çox yaxın olan rəfiqələr haqqında. *Bu qızlar lap cici-bacıdırlar.* ◻ **Cici-bacı olmaq** – bir-birilə çox yaxın olmaq, ana-bacı kimi olmaq.

**CİCİ-BACILIQ** *is.* Cici-bacı kimi olma.

**CİDA[1]** *is.* Sivri dəmir ucluqlu, dəlici qədim silah; mizraq. *Cidanı çuvalda gizlətmək olmaz.* (Ata. sözü). *Koroğlu qayıtmaz, tufan saçmasa; Cida işlətməsə, qılınc çaxmasa.* "Koroğlu". ◻ **Cida boyu** – ölçü bildirir (adətən, gün, günəş sözləri ilə deyilir). [İntelligentin anası:] [Oğlum] *gün iki cida boyu qalxmamış, üstünə diri ilan salasan, yerindən tərpənməz.* Qantəmir. [Pəri cadu:] *Əgər gün bir cida boyu qalxınca burada olmasa, sənin ətini öz anana yedirdəcəyəm.* Ə.Haqverdiyev. *Günəş bir cida boyda ucalanda uzaqda balaca bir qaraltı göründü.* P.Makulu.

◊ **Cidanın ucu çuvaldan çıxır** – b a x **xoruzun quyruğu görünür ("xoruz"**da).

**CİDA[2]** *zərf* [*fars.* cüda] *klas.* Ayrı, uzaq. *Cümləsin rahi-həqiqətdən cida görməkdəyəm..* C.Cabbarlı. ◻ **Cida düşmək, cidayə düşmək** – uzaq düşmək, ayrı düşmək. *Fikrim,*

*zikrim, sözüm, xəyalım sənsən; Haçan könlüm səndən cidayə düşər.* M.V.Vidadi. *Cida düşüb ulusundan, elindən; Ənkəbuttək can asılır telindən.* Aşıq Ələsgər. [Dərviş:] *Heyvanlar da tək-təkinə dolanmayıb, arxadaşlar gəzdikləri halda mən öz həmcinsimdən cida düşüb ormanlarda, səhralarda qalmışdım.* A.Divanbəyoğlu. **Cida etdirmək** *klas.* – ayırmaq. [Şah:] *Bu necə olan işdir! Yoxsa keşiş məni aldatdı. Bu saat onun başını bədənindən cida etdirərəm.* Ü.Hacıbəyov. **Cida salmaq** – ayırmaq, ayrı salmaq. *Əzəl ayrılığımız haqqın işidir; Fələk bizdən cida saldı sağları.* "Lətif şah". [Ruqiyyə:] *..Məni özündən cida salma, ayrılıq oduna dözə bilmərəm.* A.Divanbəyoğlu.

**CİDAL** *is.* [*ər.*] Dava, döyüş, qovğa, vuruş (çox zaman cəng-cidal şəklində işlədilir). *Əcəl köynəyini geyib əynimə; Cəng-cidalın güzarına gəlmişəm.* "Koroğlu". *Dönər günəşin atəşə, saç qərbə, şimalə; Topla nə gücün varsa, giriş qəti cidalə.* C.Cabbarlı. ☐ **Cidal etmək** – dava etmək, qovğa etmək, vuruşmaq. *Məst olub xalqa cidal etdim; Əqlimi cəhlə paymal etdim.* S.Ə.Şirvani. // Məc. mənada. *Uzun olsun ömrüm deyə; Gələn gündən borc almışam; Sözün cəngicidalında qocalmışam.* R.Rza.

**CİDALGAH** *is.* [*ər.* cidal və *fars.* gah] *klas.* Müharibə meydanı, vuruşma yeri.

**CİDAR** *is.* [*ər.*] 1. Divar, arakəsmə.

2. *məc.* Maneə.

**CİDD-CƏHD** *is.* [*ər.*] Var gücü ilə çalışma, səy etmə, cəhd göstərmə. [Nuriyyə:] *Bütün cidd-cəhdimə baxmayaraq, səsim titrəyirdi.* İ.Əfəndiyev. *Bu qələbə məktəbdə uzun illər boyu davam edən cidd-cəhdin, inadlı çalışqanlığın.. nəticəsi idi.* M.Rzaquluzadə. [Muxtar:] *Sən məni ələ salma, Firəngiz, intiqam almaq üçün cidd-cəhd əbəsdir.* B.Bayramov. ☐ **Cidd-cəhd etmək** – var gücü ilə çalışmaq, səy göstərmək. *..Zeynəb cidd-cəhd eləyirdi ki, ağlamağını büruzə verməsin ki, oğlunun ürəyi sıxılsın.* C.Məmmədquluzadə. *Bunlar vaxtında hərə öz məhəlləsinin abad olmağına cidd-cəhd etmişlər..* N.Nərimanov. [Gəldiyev] *qan-tər içində Vahidin işini tapmağa cidd-cəhd elədi.* Mir Cəlal.

**CİDDƏN** *zərf* [*ər.*] Ciddi olaraq, ciddi surətdə, gerçəkdən, həqiqətən. *Gözlənməyən ədnalığın icadına ciddən; Himmət edən insanlarına şükr, xudaya!* M.Ə.Sabir. [Rüstəmbəy:] *Tərs kimi mənim kütübxanamda da belə dolaşıq kitablar var ki, ciddən qorxmalıdır.* Çəmənzəminli. *Pası arvad Cəbini özünə alışdırır, anası Gülsənəmdən onu ciddən qoruyur, gecələri uşağı özü ilə yatırdırdı.* S.Rəhimov.

**CİDDİ** *sif.* və *zərf* 1. Öz hərəkətlərində, fikirlərində, həyata münasibətində müsbətliyi, möhkəmliyi, sabitliyi ilə fərqlənən, dərin düşünən; ağırbaşlı, təmkinli. *Ciddi adam. Ciddi oğlan.* – *Tanıyanlar bilir, yeddi yaşında; Ciddi bir qız idin, əqli başında!* Ə.Cavad. *Hələ gənc ikən çətin imtahanlardan keçmiş adamlar istər-istəməz ciddi və düşüncəli olurlar.* İ.Qasımov. // Öz işinə dərin və tələbkar yanaşan, öz işini, məsuliyyətini yaxşı bilən. *Ciddi alim. Ciddi yazıçı.* // Mənaca, məzmunca əhəmiyyətli, məzmunlu. *Ciddi danışıq. Ciddi əsər. Ciddi ədəbiyyat.* – *Muxtar heç təsəvvür etməzdi ki, açdığı söhbət bu qədər ciddi bir şəklə düşə bilər.* S.Hüseyn. *Tahirin bu cür düşüncəli və ciddi danışmağı Lətifəni sevindirirdi.* M.Hüseyn. // Zarafatsız, zarafat olmayan. *Ciddi deyirəm. Sözüm ciddidir.* // Həqiqi, əsil, gerçək. *Ciddi hiss. Ciddi inam. Ciddi sevgi. Ciddi vədə.* // Əsaslı, əməlli-başlı. *Dərs keyfiyyəti uğrunda ciddi mübarizə aparılırdı.* S.Rəhimov. *Bəzən təsadüfən başlanan söhbət bir kitabın və ya bir məsələnin ciddi müzakirəsinə çevrilirdi.* Ə.Sadıq.

2. Əhəmiyyətinə və ya aqibətinə görə xüsusi diqqət tələb edən. *Ciddi xəstəlik. Ciddi vəziyyət qarşısında qalmaq.* – *O, ciddi bir fəlakətin başlandığını duydu.* S.Rəhimov. *Arvadının belə sadəliyi və ciddi məsələyə yüngül baxması Yavərə toxundu..* M.İbrahimov. *Düşündürdü məni xeyli; Onun belə ciddi halı.* N.Rəfibəyli. // Böyük, əsaslı. *Ciddi çətinliklər qarşısında qalmaq.* – *Beləliklə, qəzet yarandığı gündən ciddi nəzarət altında idi.* M.İbrahimov.

3. Fikirli, fikrə dalmış, dalğın, əndişəli, iztirablı. // Ciddiyyət, qayğı, təlaş, iztirab, əndişə ifadə edən. *Ciddi görkəm. Ciddi tonla danışmaq.* – *Ruhnəvaz xanım ciddi baxışına*

*heç də təğyir verməyərək Qurbanlının qarşısında oturdu.* Çəmənzəminli. *Mahirə .. feldşerə qələbə çaldığını kəsdirdi, ciddi bir hal aldı.* M.Hüseyn.

**CİDDİLƏŞDİRMƏ** "Ciddiləşdirmək"dən *f.is.*

**CİDDİLƏŞDİRMƏK** *f.* Ciddi eləmək, ciddi şəkil vermək. *Üzünü ciddiləşdirmək. – Çingi gülüş vəziyyətindəki simasını ciddiləşdirərək masanı taqqıldatdı...* Çəmənzəminli. // Ciddi xarakter vermək, ağırlaşdırmaq. *Məsələni ciddiləşdirmək.*

**CİDDİLƏŞMƏ** "Ciddiləşmək"dən *f.is.*

**CİDDİLƏŞMƏK** *f.* 1. Ciddi görkəm almaq, ciddi şəkil almaq, ciddi tövr almaq. – *Nəhayət, studentin siması qayət ciddiləşdi; xanıma baxmayaraq otağının qapısını açdı..* Çəmənzəminli. *Sədrin üzü ciddiləşdi.* İ.Əfəndiyev. *Qardaşı oğlunun gözlərində təşviş və həyəcan oxuyanda istər-istəməz Sultanın da sifəti ciddiləşdi.* İ.Hüseynov.

2. Güclənmək, şiddətlənmək, gərginləşmək, ciddi şəkil almaq. *Mübahisə getdikcə ciddiləşdi. – Məsələ ciddiləşmişdi, xalq həyəcanda idi.* S.Hüseyn. *Ceyran müəllimənin sinfində dərslər ciddiləşir*(*di*).. S.Rəhimov.

**CİDDİLİK** *is.* 1. Ciddiyyət, ağırbaşlılıq, təmkin. // Ciddi adamın halı. *Ruhnəvaz xanım adi ciddiliyi ilə əl verdi və* [Qurbanlını] *qapıya qədər təşyi etdi.* Çəmənzəminli. *Qəhrəman gördü ki, oğlu* [Sabirdə] *böyüklərə məxsus ciddilik əlamətləri özünü göstərməyə başlayır.* S.Rəhimov. *Adamlarda bir ciddilik, bir gərginlik duyuldu.* Mir Cəlal.

2. *məc.* Ağırlıq, mürəkkəblik, gərginlik. *Şəraitin ciddiliyi. İşin ciddiliyi.* – [Qəhrəman:] *Atəş getdikcə şiddətlənir və vəziyyətin ciddiliyini andırırdı.* H.Nəzərli.

**CİDDİYYƏT** [*ər.*] B a x **ciddilik** 1-ci mənada. *Üzlərdə ciddiyyət, gözlərdə inam; Döyünən qəlblərdə bir hiss – intiqam!* R.Rza. *Tahirzadə ciddiyyətini pozmadı. Səsini daha da ucaltdı.* Mir Cəlal. *Sənubərin sifətinə ciddiyyət gəldi.* B.Bayramov.

**CİDDİYYƏTLƏ** *zərf* Ciddi surətdə, ciddi bir şəkildə, ciddiliklə. *Ciddiyyətlə işə girişmək. – Sona ciddiyyətlə əmisinə cavab verdi..* Ə.Əbülhəsən. – *Biz niyə? – deyə, Simuzər eyni ciddiyyətlə cavab verdi.* H.Seyidbəyli.

**CİFT** [*fars.*] *köhn.* B a x **cüt**[1] 1-ci mənada. *Getmişdi bir cift dana; Otlamağa bir yana.* A.Səhhət. [Dərviş:] [Qızın] *hər biləyində bir cift bilərzik, başında rəngbərəng iki ipək dəsmal var idi.* A.Divanbəyoğlu. [Qız üçün] *bir cift yastıq, bir cift mütəkkə, bir cift dövr döşək, bir ədəd qayınana döşəyi, iki dəst yorğan-döşək.. tədarük görünəcəkdir.* R.Əfəndiyev.

**CİFTLƏŞDİRMƏ** "Ciftləşdirmək"dən *f.is.*

**CİFTLƏŞDİRMƏK** b a x **cütləşdirmək**.

**CİFTLƏŞMƏ** "Ciftləşmək"dən *f.is. Həmişə əlləri pencəyinin cibində olan cavan çoban təklif eləyirdi ki, əgər lazımi şərait yaradılsa, ciftləşmə faraş aparılsa .. hər yüz qoyundan orta hesabla iki yüz quzu almaq olar.* Ə.Vəliyev.

**CİFTLƏŞMƏK** b a x **cütləşmək**.

**CİHAD** *is.* [*ər.*] Din uğrunda müharibə, din yolunda vuruşma.

**CİHAZ** *is.* [*ər.*] 1. Hər hansı bir işi görmək üçün alət, aparat, mexanizm. *Çəki cihazları. Optik cihaz. İsidici cihaz. – Bunların əlində ov tüfəngi deyil, cürbəcür ölçü alətləri və cihazları vardı. M.Rzaquluzadə. Masaların üstündə çoxlu dəmir və şüşə cihaz, boru və sairə görünürdü.* M.Süleymanov. // Bir neçə əşyadan, hissədən ibarət alət, ləvazimat, komplekt. *Yazı cihazı. Üzqırxan cihaz. Süfrə cihazı* (qab-qacaq, çəngəl-bıçaq, qaşıq və s.).

*2. fiziol.* Orqanizmdə müəyyən vəzifə ifa edən orqanlar. *Həzm cihazı.*

3. *köhn.* Cehiz. *Böyükxanım .. sandıqları açıb öz atasından gətirmiş cihazlarını töküb, hansı Münəvvər xanıma layiq isə ayırıb, bir tərəfə qoyurdu.* M.S.Ordubadi.

**CİHAZQAYIRAN** *sif.* Müxtəlif cihazlar hazırlayan, istehsal edən. *Cihazqayıran zavod.* // İs. mənasında. *Cihazqayıranlar .. yeni məhsulların kütləvi buraxılışını təşkil etməyi və qaydaya salmağı öhdələrinə almışlar.*

**CİHAZQAYIRMA** *is.* Müxtəlif cihazlar və onların hissələrini istehsal etmə, cihaz istehsalı ilə məşğul olma. *Cihazqayırma sənayesi. Bakı cihazqayırma zavodunun məhsulları. Cihazqayırmanın sürətlə inkişaf edən istiqamətləri.*

**CİK-BİK: ciki-biki, cikinə-bikinə kimi (qədər), cikini-bikini də, cikini də-bikini də** – hərtərəfli, ən kiçik təfərrüatına qədər.

[Rəşid müəllim:] *Yox, usta Əbülqasım, gərək sən bu maşının cikini-bikini tamam-kamal biləsən.* S.Rəhimov. [Tahir:] *Sən deyirdin,* [Lətifənin] *nişanlısı var. Mən cikini-bikini öyrənmişəm. Nişanlısı-zadı yoxdur.* M.Hüseyn. [Həmzə:] *Yaxşı, indi başlayaq ciki-biki ilə hər şeydən danışmağa…* Ə.Əbülhəsən. *Halbuki biz onların cikini də-bikini də yoxlamışıq..* H.Seyidbəyli.

**CİK-CİK** *təql.* Sərçələrin və qeyri kiçik quşların çıxardığı səs. *Nədir o istəkli, o heyran baxış? Nə dadlı cik-cik, nə gözəl çırpınış!* A.Səhhət. *Biçinçilərdən biri orağını böyük bir qanqalın kökündən endirərkən quş balaları "cik-cik" edib .. qalın otlar arasına soxuldular.* A.Şaiq. *Nurəddin bir də gördü ki, bir ana sərçə ağzında bir göy cücü pəncərənin üstünə qondu və oradan cik-cik səsi gəldi.* S.S.Axundov.

**CİKKƏ: cikkə çəkmək** – nazik səslə bərk qışqırmaq. *Arvad cikkə çəkdi.*

**CİKKİLDƏMƏ** "Cikkildəmək"dən *f.is.*

**CİKKİLDƏMƏK** *f.* 1. Cik-cik səs çıxarmaq (körpə quşlar haqqında). *Cikkildəyir quşlar yuvalarında; Köçərilər durmuş ovalarında.* A.Səhhət. *Cik-cik gəldi, cikkildədi; Qanadını büküb dedi: – Yumurtadan çıxdım təzə; Umac verir nənə bizə.* M.Dilbazi.

2. *məc. dan.* Yersiz söhbətə qarışmaq, müdaxilə etmək. *Bu nə cikkildəyir?*

**CİKKİLDƏŞMƏ** "Cikkildəşmək"dən *f.is.*

**CİKKİLDƏŞMƏK** *qarş.* Ağız-ağıza verib cikkildəmək. *Yaşıl tumurcuqları göyərmiş budaqlarda quşlar cikkildəşirdi.* M.Süleymanov.

**CİL** b a x **cığ**. *Cil – bataqlıqlarda bitən çoxillik ot olub, kökəbənzər gövdəsində aşı maddəsi vardır. Azərbaycanda çox müxtəlif növləri bitir.* R.Rzazadə.

**CİLA** *is.* [*ər.*] İşığı əks etdirəcək dərəcədə parıltılı olmaq üçün əşyanın üzərinə çəkilən maddə və bu maddə ilə əşyaya verilən parlaqlıq; ümumiyyətlə, parıltı, parlaqlıq. *Nə gözəl sürmədən cila gətirdi; Döndü bir afəti-cana gözlərin.* M.P.Vaqif. *Yüz il gər hicr çəksə, qəlbi-aşiqdən səfa getməz; Tila xak içrə qalmaqçın vücudundan cila getməz.* S.Ə.Şirvani.

**CİLAÇI** b a x **cilalayıcı**.

**CİLALAMA** "Cilalamaq"dan *f.is. Mayeli cilalama dəzgahı. Xarrat cilalaması.*

**CİLALAMAQ** *f.* Əşyaya cila vermək, sürtməklə parıldatmaq, parıltı vermək. *Qiymətli daşları cilalamaq. Mərcanı cilalamaq. – Əsrlər boyu dalğalar bu daşları elə yuyub cilalamışdı ki, onlar güzgü təki bərq vururdu.* M.Süleymanov. // *məc.* Yaxşılaşdırmaq, təkmilləşdirmək, gözəlləşdirmək. *Xalq öz mahnılarını əsrlər boyu cilalayır və təkmilliliyin ən yüksək dərəcəsinə çatdırır.* Ə.Bədəlbəyli. *Hələ bərkdə-boşda bişməmiş cavan .. düşüncələrini cilalayıb, axırını bir səmtə çıxara bilmədi.* B.Bayramov.

**CİLALANMA** "Cilalanmaq"dan *f.is.*

**CİLALANMAQ** *f.* 1. Hamarlanmaq, taraşlanmaq (sürtülməkdən). // Məc. mənada. *Günəş çıxdı, ziyalandı yer üzü; Cilalandı, səfalandı yer üzü.* A.Səhhət.

2. Yaxşılaşmaq, təkmilləşmək, gözəlləşmək.

**CİLALAYICI** *is.* Əşyaya cila verən usta; cilaçı. [Rəis:] *Çox diribaş qızdır, yaxşı cilalayıcı olması səndən asılıdır.* (Qəzetlərdən).

**CİLALI** *sif.* Cilası olan, cilalanmış, taraş edilmiş, parıldadılmış. *Cilalı almaz.*

**CİLD** *is.* [*ər.*] 1. Kitabın üzü, üz qabığı. *Kitabın cildində qara ramka içərisində döşdən yuxarı çəkilmiş bir adam şəkli vardı.* M.İbrahimov.

2. Böyük bir əsərin ayrı-ayrı kitab şəklində olan hissələrindən hər biri, həmçinin ayrıca kitab şəklində olan çap əsəri. *Ensiklopediyanın ikinci cildi. – Dəmirov əlini uzadıb cildləri özünə tərəf çəkdi və səliqə ilə düzəltdi.* S.Rəhimov. [Vahid:] *Gecə-gündüz yazdığın o cildlərin sahibləri heç zaman sənin zəhmətini unutmazlar, ana!* B.Bayramov.

3. *məc.* Don, qiyafə. *Ötər keçdiyiniz yerdə bayquşlar; Qəhrəman cildinə girən sərxoşlar!* H.Cavid. [Səfərəli:] *Deməli, gedək cildimizi dəyişməyə.* H.Nəzərli.

◊ **Cilddən-cildə girmək** – b a x **dona (min dona) girmək** (**"don**[1]**"**da). [Professor:] *Cilddən-cildə girən bu bürüncəkli adamlara qarşı çox kəskin, çox amansız mübarizə aparmaq lazımdır..* S.Rəhimov. **...cildinə girmək** – yalandan özünü ... oxşatmaq, yalandan özünü ... kimi göstərmək. *Müəllif sanki özü Fərhad cildinə girərək, irəli gəlir və*

*ürəyini boşaldır.* M.İbrahimov. **Cildini dəyişmək** – başqa dona girmək, hər hansı mühitə, şəraitə uyğunlaşmaq. *Kərəmov mühitə uyğun olaraq kərtənkələ kimi cildini dəyişsə də, elə həmin Kərəmovdur.* İ.Əfəndiyev.

**CİLD-CİLD** *zərf* Cildlərlə, çoxlu. *Rəfə cild-cild kitablar düzülmüşdür.*

**CİLDÇİ** *is.* Cildçəkən usta. *Kitabı cildçiyə vermək.*

**CİLDÇİLİK** *is.* Cildçinin işi, peşəsi. *Cildçilik eləmək.*

**CİLDXANA** *is.* [*ər.* cild və *fars.* ...xanə] Cild çəkilən emalatxana (sex). *Kitabları cildxanaya aparmaq. – İndi isə* [Mirzə Qədirin] *son sistemdə dörd böyük çap maşını, ayrıca cildxanası vardı.* S.Hüseyn.

**CİLDLƏMƏ** "Cildləmək"dən *f.is. Mətbəənin cildləmə sexi.*

**CİLDLƏMƏK** *f.* Kitaba və s.-yə cild çəkmək. *Ümumi dəftəri cildləmək. Gündəliyi cildləmək.*

**CİLDLƏNMƏ** "Cildlənmək"dən *f.is.*

**CİLDLƏNMƏK** *məch.* Cild çəkilmək. *Qəzetlər cildlənib.*

**CİLDLƏNMİŞ** *f.sif.* Cild halına salınmış, cild çəkilmiş, cildli. *Jurnal-qəzetlərin səliqə ilə tikilib cildlənmiş nömrələri indi töküləb, biri-birinə qarışmışdı.* Ə.Əbülhəsən.

**CİLDLƏTDİRMƏ** "Cildlətdirmək"dən *f.is.*

**CİLDLƏTDİRMƏK** b a x **cildlətmək**.

**CİLDLƏTMƏ** "Cildlətmək"dən *f.is.*

**CİLDLƏTMƏK** *icb.* Cild çəkdirmək, cild vurdurmaq, üz çəkdirmək. *Jurnalları cildlətmək. Kitabı cildlətmək.*

**CİLDLİ** *sif.* Cild çəkilmiş, cildi olan. *Qırmızı cildli kitab. – Qazı .. kitabları eşib, bir qara cildli kitab gətirib açdı.* C.Məmmədquluzadə. *Saleh çeşməyini taxıb kitab oxuyur, arabir qara cildli bloknotuna nə isə qeyd edirdi.* Ə.Vəliyev.

**CİLDLİK** *is.* Cild çəkməyə yarar. *Cildlik dəri. Cildlik kordon.* // Cildlərdən ibarət, küll halında. *M.Füzulinin 6 cildliyi.*

**CİLDSİZ** *sif.* Cildi olmayan, cild çəkilməmiş. *Cildsiz jurnal. – Pəncərədən külək əsir, cildsiz kitabın cırıq vərəqini tərpədirdi.* Ə.Vəliyev.

**CİLET** b a x **jilet**. *Tacir Əli qara pencəyinin ətəyini açdı, ciletinin cibindən .. iri cib saatını çıxardı.* M.İbrahimov.

**CİLİK-CİLİK: cilik-cilik olmaq** – ciliklənmək, tikə-tikə olmaq, parça-parça olmaq, qəlpə-qəlpə olmaq, sınıq-sınıq olmaq. *Stəkan yerə düşüb cilik-cilik oldu. – Lap yaxında pəncərələrdən birinin qapağı açılıb taqqıldadı, şüşələr asfalta tökülüb cilik-cilik oldu.* M.Hüseyn. *Əmanət alınmış bir neçə büllur qədəh ilə bir neçə meyvə vazası aşıb cilik-cilik oldu.* M.Rzaquluzadə. **Cilik-cilik eləmək** – tikə-tikə eləmək, parça-parça eləmək, sınıqçu] *nə götürürdü, o saatca salıb cilik-cilik eləyirdi.* İ.Hüseynov.

**CİLİKLƏNMƏ** "Ciliklənmək"dən *f.is.*

**CİLİKLƏNMƏK** *f.* Cilik-cilik olmaq, tikə-tikə olmaq, parça-parça olmaq, qəlpələnmək. *Şüşə daşa dəyib cilikləndi.* B.Bayramov.

**CİLLİK** b a x **cığlıq**. *At cilliyə girmiş kimi ayağını qoyub götürdükcə bataq səslənirdi.* Mir Cəlal.

**CİLOV** *is.* Qoşqu ləvazimatının, ağızlığa (kəmə) bənd edilmiş uzun hissəsi; qayışdan (ya ipdən) ibarət olan və qoşulmuş atı idarə etməyə xidmət edən hissəsi. *Atın cilovundan yapışmaq.* – [Yusif Sərrac] *oturub, əlindəki cilovu tikib, tamam edirdi, çünki müştəri tapşırmışdı ki, gərək o gün hazır ola.* M.F.Axundzadə. *Usta əlindəki cilovu tikib hazırlamağa çalışır*(*dı*). A.Şaiq. *Kəndli. atın cilovundan tutdu.* M.Hüseyn. // *məc*. İtaətdə, əldə saxlamaq, əl-qol açmağa qoymamaq üçün vasitə, qüvvə. [Kürd Musa:] *Şaliko, Şaliko! Qüvvət bizdədir; Dünyanın cilovu əlimizdədir.* S.Vurğun.

◊ **Başına cilov keçmək** – *məc.* evlənmək, başı bağlanmaq. [Nənəxanım:] [Şaqqulunun] *başına cilov keçəndən sonra mən də rahat olaram, daha kişinin kötəyini yemərəm.* Çəmənzəminli. **(Əlindən) cilov gəmirmək** – birinin əlindən çox bərk hirslənmək, ona qarşı kin bəsləmək, onu cəzalandırmaq üçün fürsət aramaq. [Göyüş:] [Salmanın] *fermaya getməyindən xəbər tutan Veysəl də Əhməd kimi cilov gəmirirdi.* Ə.Abbasquliyev. **Cilovda saxlamaq** – tabeliyində, əlində saxlamaq. **Cilovu əlində olmaq** – tamamilə asılı olmaq, itaətində olmaq. [Qədir:] *Bizim fağır-füqəranın cilovu həmişə sizin əlinizdə olub.* Mir Cəlal. **Cilovundan tutub geri çəkmək** – b a x **cilovunu yığış-**

**dırmaq (yığmaq, çəkmək, dartmaq)**. *Birinci qadın bir az susduqdan sonra fikirli halda dedi: – İndi möhkəm bir əl lazımdır ki,* [Rəşidin] *cilovundan tutub geri çəksin.* Ə.Məmmədxanlı. **Cilovunu (əldən) buraxmaq (vermək)** – birinə tam sərbəstlik vermək, başlı-başına buraxmaq. **Cilovunu əlində saxlamaq** – bax **cilovda saxlamaq**. [Sürəyya:] *Amma, qızım, Zakirin cilovunu əlində möhkəm saxla ha!* H.Seyidbəyli. **Cilovunu yığışdırmaq (yığmaq, çəkmək, dartmaq)** – bax **ipini çəkmək** (“**ip**”də). [Gülməmməd:] *Vaxtında cilovunu çəkmədin. İndi də dalını bağlamaq olmayır.* Ə.Haqverdiyev. [Rüstəm Qaraşa:] *Nə* [Mayanın] *dədəsi məlumdur, nə nənəsi! Vaxt ikən cilovunu bərk yığışdır, sonra gec olar!* M.İbrahimov.

**CİLOVDAR** *is.* 1. Qabaqda gedən atın cilovundan tutub çəkən adam. *Vaqif cilovdarları, zinpuşçuları və yanınca götürdüyü Səfəri atların yanında qoydu.* Çəmənzəminli.

2. *məc.* Öncül, öndə gedən. *Karvanın cilovdarı*.

**CİLOVLAMA** “Cilovlamaq”dan *f.is.*

**CİLOVLAMAQ** *f.* Başına cilov keçirmək, yüyənləmək. *Atı cilovlamaq. – Atını minən cilovlar.* (Ata. sözü). *Vəzirlə vəkil sarısaç adamın atını cilovlayıb saxladı.* Ə.Vəliyev. // *məc.* Saxlamaq, yığışdırmaq, boğmaq, əl-qol açmağa qoymamaq. *Rübabə kirpiklərini qaldırıb, atasını qarşısında görəndə ürəyinə təskinlik verməyə, hissini cilovlamağa çalışdı.* Mir Cəlal. [Bayram kişi:] *Əftəranda da dəli xəzrini cilovlamaq lazımdır.* M.Rzaquluzadə.

**CİLOVLANMA** “Cilovlanmaq”dan *f.is.*

**CİLOVLANMAQ** *məc.* Başına cilov keçirilmək (taxılmaq). // *məc.* Qabağı, qarşısı alınmaq.

**CİLOVLU** *sif.* Başına cilov vurulmuş, cilovu olan. *Cilovlu at.*

**CİLOVSUZ** *sif.* Başına cilov vurulmamış, cilovu olmayan. // *məc.* Ram olmayan, ipə yatmayan, azğın. *Məndə nə iradə, nə ixtiyar var; Xəyalım cilovsuz bir dəli ruzgar.* S.Vurğun.

**CİLVƏ** *is.* [*ər.*] Dilbərcəsinə hərəkət, naz, qəmzə, işvə; hərəkətdə, davranışda, danışıqda incəlik, zəriflik, gözəllik, lətafət. *Sığallama hərdəm tərlan quş kimi; Tamam sümüyündə cilvə gərəkdir.* M.P.Vaqif. [Xəyyam:] *Gəl, gəl, olayım səndəki hər cilvəyə qurban; Bilməm, niyə getdin, niyə döndün, niyə baxdın?* H.Cavid. *Bütün varlıq .. füsunkar bir cilvədə* [şairin] *gözlərində işıqlanırdı*. Ə.Məmmədxanlı.

**CİLVƏKAR** [*ər.* cilvə və *fars.* ...kar] *klas.* bax **cilvəli**.

**CİLVƏKARLIQ** *is.* İşvəkarlıq, nazlılıq, qəmzəlilik, nazəninlik; nazsatma.

**CİLVƏLƏNMƏ** “Cilvələnmək”dən *f.is.*

**CİLVƏLƏNMƏK** *f.* Nazlanmaq, naz etmək, əzilib-büzülmək. *Tavus kimi cilvələnə hər səhər; Bəzək verə camalına sərbəsər.* M.P.Vaqif. *Görürsənmi oğrun baxan gözəli; Tərlan kimi necə cilvələnibdir?* Aşıq Ələsgər *..Xanım rübəndi və çarşabı atıb, mərsiyəxanın qarşısında cilvələnməyə başladı.* Çəmənzəminli. // Məc. mənada təşbehlərdə. *Su üstündə cilvələnir; Söyüdlərin yarpaqları.* B.Vahabzadə.

**CİLVƏLİ** *sif.* Nazlı, qəmzəli, işvəli, dilbər, nazənin. *Cilvəli qız. Cilvəli qadın.* // Məc. mənada təşbehlərdə. [Dərviş:] *Qoca kişi özü cilvəli oğlan kimi tərpənib, alaçıqdan tüfəngi gətirdi..* A.Divanbəyoğlu. *Cilvəli tərlanım, düşürsən yola; Qolac qollarını boynuma dola.* Aşıq Hüseyn.

**CİM** *is.* [*ər.*] Ərəb əlifbasında “ج” şəklində yazılan hərfin adı.

◊ **“Cim”in yanına “rey” qoymaq** *zar.* – qaçmaq, dabanına tüpürmək, daban almaq.

**CİN[1]** *is.* 1. [*ər.*] Nağıllara və bəzi inanclara görə gözə görünməyən varlıq mövhumi bir məxluq. *Cini tutub evdə işlədirmişlər. Cin hər işi tərsinə eləyirmiş.. Cin hər gün yalvarırmış ki, üstündəki iynəyi çıxartsınlar. Çünki cinlər iynədən qorxurlar..* (Nağıl). *Hələ uşaqlıqda* [Yarməmməd] *eşitmişdi ki, boş çöllər cinlərlə dolu olur.* M.İbrahimov.

2. *məc.* Xırdaca, cılız, lakin çevik, zirək uşaq haqqında. *Elə bil bu uşaq cindir.*

◊ **Cin atına mindirmək** – bərk hirsləndirmək, cinləndirmək. *Belə hərəkət Səkinəni lap cin atına mindirərdi.* M.İbrahimov. *Xannazirin .. qaçıb gəlməsi Hacı Səmsamı cin atına mindirmişdi.* P.Makulu. **Cin atına minmək** – bərk hirslənmək, cinlənmək. **Cin başına (beyninə, təpəsinə) vurmaq** – bax **cin atına minmək**. [Koxa:] *Cin vurdu başıma, çıxdım özümdən; Hamısın doyunca*

*kötəklədim mən.* S.Rüstəm. *Cin vurdu Gəldiyevin başına, istədi* [Ağca xanımı] *götürüb mıxlasın yerə.* Mir Cəlal. **Cin bismillahdan qorxan kimi qorxmaq** – bir şeydən və ya adamdan çox bərk qorxmaq, ehtiyat etmək, çəkinmək. **Cin dəmirdən qorxan kimi qorxmaq** – b a x **cin bismillahdan qorxan kimi qorxmaq**. **Cin kimi** – zəkalı, zirək adam haqqında. **Cin tutmaq** – dəli olmaq, çıldırmaq. **Cini tutmaq** – birdən bərk hirslənmək, bərk acığı tutmaq. **Cinini başına yığmaq** – b a x **cin atına mindirmək**. **Cinni-Cəfər qoşunu (kimi)** *zar.* – çox hay-küylü, səs-küylü uşaq izdihamı haqqında.

**CİN**[2] *is.* [*ing.*] Giləmeyvələrdən çəkilmiş ingilis arağı.

**CİNAH** *is.* [*ər.*] Tərəf, qol (orduda). *Sol cinah. – Piyadalar səf çəkib, tutub sağ-sol cinahı.* R.Rza. *Bunsuz da sağ cinahda batalyonun üçüncü bölüyü düşmənlə şiddətlə çarpışmaqda idi.* Ə.Əbülhəsən. *Bölük düşmənin sağ cinahı üzərinə əks-hücuma keçdi.* İ.Əfəndiyev.

**CİNAS** *is.* [*ər.*] *ədəb.* Tələffüzcə bir-birinə yaxın, mənaca müxtəlif sözlər. *M.P.Vaqifin cinasları.*

**CİNAYƏT** *is.* [*ər.*] 1. Mövcud quruluşa qarşı yönəldilmiş və ya mövcud hüquq qanun və qaydalarını pozan ictimai baxımdan təhlükəli hərəkət; suç. *Cavahir xanımı adam öldürmək kimi böyük bir cinayətə vadar edən nə idi?* T.Ş.Simurq. *Cinayət sübut olunana qədər Bəndalını Tahirzadəyə zaminə verdilər.* Mir Cəlal.

2. *məc.* Yolverilməz, yaramaz, pis hərəkət, əməl.

**CİNAYƏTKAR** *is.* [*ər.* cinayət və *fars.* ...kar] Cinayət edən, cinayət törədən adam; suçlu. *Bu müqəddəs arzulara hər xor baxan cinayətkar; Anaların üsyanilə yerə düşüb olacaq xar.* N.Rəfibəyli. *Teymur bu cinayətkarlar dəstəsini qolbudaqlı bir ağaca bənzətməkdə səhv eləməmişdi.* H.Seyidbəyli.

**CİNAYƏTKARANƏ** b a x **cinayətkarca(sına)**.

**CİNAYƏTKARCA(SINA)** *zərf* Cinayətkar kimi, cinayətkarlıqla, canicəsinə. *Cinayətkarcasına hərəkət.*

**CİNAYƏTKARLIQ** *is.* Cinayət mahiyyətində olan, cinayət xarakteri daşıyan hərəkət, iş. *Pərzad cinayətkarlığını anladığından sonra orada, o kimsəsiz damda qalmayacaqdır.* Mir Cəlal.

**CİNAYƏTLİ** *sif.* Əsasında cinayət olan, cinayət məqsədilə olan. *Cinayətli qəsd.*

**CİNBAZ** b a x **cindar**.

**CİNBAZLIQ** b a x **cindarlıq**.

**CİNCİLİM** *is. bot.* Nəm yerlərdə bitən, yatıq gövdəli, xırda güllü yeyilən ot bitkisi. *Cincilim qutabı. – Qızlar meşənin ətrafındakı göy çəmənliyi gəzdilər, dolandılar, cincilim, qazayağı yığıb ocaq qaladılar, oturdular, yedilər, aclıqları getdi.* (Nağıl). *..Nabat arvad sac asıb cincilim kətəsi salırdı.* B.Bayramov.

**CİNDAR** *is.* [*ər.* cin və *fars.* ..dar] *köhn.* Cinləri guya özünə tabe etməklə onların zərərini aradan qaldıra bilən adam. *Ol gün ki, sənə xaliq edər lütf bir övlad; Olsun ürəyin şad; Təyin elə cindarı ki, etsin ona imdad. Ta dəyməyə həmzad.* M.Ə.Sabir. *Sevər səhərdən axşamadək tanış evləri dolanıb, harada bir yaxşı cindar, yaxşı falçı, yaxşı dua yazan, yaxşı nəfəs sahibi dərviş tapsa idi, onun qapısına gedərək, qızı üçün əlac axtarardı.* P.Makulu.

**CİNDARLIQ** *is. köhn.* Cindarın işi, peşəsi.

**CİNG**[1] *təql.* Mis, dəmir, şüşə kimi şeylərin başqa bir şeyə və ya bir-birinə toxunmasından hasil olan spesifik səs. ☐ **Cing-cing cingildəmək** – arasıkəsilmədən cingilti səsi çıxartmaq. [Həpir] .. *hərdən elə qışqırır ki, evin səqfi cing-cing cingildəyir.* Mir Cəlal. // Məc. mənada. [Qızların] *sinələrindən fəvvarə kimi gülüşlər qalxıb cing-cing cingildəyir, sanki gümüş tabağa mirvari dənələri tökürsən...* E.Sultanov.

**CİNG**[2] *is. zool.* Sərçədən kiçik, çölbülbülü cinsindən quş.

**CİNGƏNƏ** *sif.* Xırdaca, balaca. *Cingənə qız.*

**CİNGİLDƏMƏ** "Cingildəmək"dən *f.is.*

**CİNGİLDƏMƏK** *f.* Cingiltili səs çıxarmaq, cingilti çıxarmaq. *Tas ya düşdü, ya cingildədi.* (Məsəl). *Yavaş-yavaş gümüş qaşıqlar da stəkanlara dəyib cingildədi.* Çəmənzəminli. *Nəhayət, ümumi sükut içində qazanın mis səsi cingildədi.* T.Ş.Simurq. *Üzəngilər qeyri-müntəzəm bir halda cingildədi.* M.Hüseyn.

◊ **Qulağı cingildəmək** – b a x **qulaq**.

**CİNGİLDƏTMƏ** "Cingildətmək"dən *f.is.*

**CİNGİLDƏTMƏK** *f.* Şüşə, mis, metal və bu kimi şeyləri toxundurmaqla cingilti səsi çıxarmaq. [Aslan] *orağı bir neçə dəfə cingildətdikdən sonra qara keçədən tikilmiş oraq qabına qoyub sarıdı.* Ə.Vəliyev. *Sultan və Səməd qədəhləri cingildədib dinməzcə içdilər.* İ.Hüseynov.

**CİNGİLTİ** *is*. Metal, şüşə və bu kimi şeylərin başqa bir şeyə toxunarkən çıxardığı səs. [Ağca xanım] *..barmağı ilə şüşəni döydü. Şüşə cingilti ilə sınıb yerə töküldü.* S.S.Axundov. *..Ləpələrin şırıltısı adamların səs-küyünə və dəmir cingiltilərin, qarışıb ətrafa yayılırdı.* M.Süleymanov.

**CİNGİLTİLİ** *sif.* Zil, nazik. *Şahpərinin cingiltili səsindən diksinən oğlan əlini lampadan çəkdi.* B.Bayramov. *Silaya indi elə gəldi ki,* [qızın] *ağ əllərini belə görür, cingiltili, şən səsini eşidirdi.* S.Vəliyev.

◊ **Cingiltili samit** *dilç.* – səs tellərinin iştirakı ilə tələffüz edilən səs ("*kar samit*" ziddi).

**CİNGİM: cingim-cingim olmaq** – xıncım-xıncım olmaq, tikə-tikə olmaq, parça-parça olmaq. [Şərif Almasa:] *Elə ki vurmadım əlimi yerə, çernilqabı cingim-cingim oldu.* C.Cabbarlı.

**CİNGİR** b a x **cürə**[3].

**CİNGÖZ** *sif.* Xırda, iti gözləri olan; bicgöz. *Cingöz adam. – Faytonçu gödəkboy, cingöz bir kişi idi.* S.Rəhman.

**CİNLƏNDİRMƏ** "Cinləndirmək"dən *f.is.*

**CİNLƏNDİRMƏK** b a x **cinlətmək**.

**CİNLƏNMƏ** "Cinlənmək"dən *f.is.*

**CİNLƏNMƏK** *f.* Bərk hirslənmək, qızmaq, özündən çıxmaq, acığı tutmaq. *Əllaf elə cinlənmişdi ki, səsi bazarı tutmuşdu.* Mir Cəlal. [İlyas Adiləyə:] [Tərlan] *tez-tez fınxırıb cilovunu gəmirir, alovlu qara gözlərini süzərək mənim altımdakı ata baxır, cinlənib acıqlanırdı ki, biz onun ayağına cidar olub, onu tutub saxlayırıq.* Ə.Məmmədxanlı.

**CİNLƏTMƏ** "Cinlətmək"dən *f.is.*

**CİNLƏTMƏK** *icb.* Bərk hirsləndirmək, acıqlandırmaq; özündən çıxarmaq, acığını tutdurmaq. [Xala:] *Ay bala,* [Yaqut] *səni cinlətmək üçün elə deyirdi.* Ə.Məmmədxanlı.

**CİNLİ** *sif.* Dəli, ağlı yerində olmayan, çılğın. [Səfi:] *Boyunduruğu yerdə qalar, Xanqulu cinlidir, xata törədib dağa qalxar.* S.Rəhimov. // Hirsli, acıqlı. *Qaranın cinli gözləri mülayim bir işıqla doldu..* Ə.Məmmədxanlı.

**CİNLİ-CİNLİ** *zərf* Cinli halda, hirsli-hirsli, acıqlı-acıqlı. *Cinli-cinli baxmaq.*

**CİNS**[1] *is.* [*ər.*] 1. Orqanizmin doğub-törəmə prosesilə bilavasitə və ya bilvasitə bağlı olan və orqanizmlərin çoxunda kişi, ya qadın fərdlərini ayırd etməyə imkan verən əlamətlərin məcmusu, habelə canlı vücudların iki kateqoriyasından (kişi və qadın, erkək və dişi) biri. *Kişi cinsi. Qadın cinsi.* // Müəyyən cinsə mənsubiyyət; qadın, ya kişi, erkək, ya kişi. *Cins cinsini həmişə cəlb eylər; Yoxdu bu işdə söhbəti digər.* S.Ə.Şirvani.

2. Nəslən keçən müəyyən əlamət və xüsusiyyətlərə malik ev heyvanları və ya başqa heyvanlar qrupu. *Qarabağ cinsindən olan at. İt cinsi. Seleksiya nəticəsində yeni qoyun cinsləri almaq.* // *sif. mənasında*. Yaxşı cinsdən olan, əsilli. – *Cins madyan balanı döşündə saxlar.* (Ata. sözü). [Həsən xan Alıya:] *Eşitmişəm, sənin yaxşı cins atların var.* "Koroğlu".

3. Soy, nəsil, mənşə, əsil-nəsəb. □ **Bəşər cinsi** – insan, adam. [Dərviş:] *İns və cinsdən ayrı düşüb, heyvanlara qarışmaqdan qayət usanmışdım.* A.Divanbəyoğlu. [Hacı Rəsul:] *Belə də səs, belə də məlahət olarmı! Düşünürsən ki, bəşər cinsi deyil, nədi, özü də kəndistan yerində.* Mir Cəlal.

4. Növ, çeşid. *Ənva cins və nəslə mənsub qədəhlər qalxdı, araq boğazları qıcıqlayaraq keçib getdi.* Çəmənzəminli.

**CİNS**[2] *is.* [*ing.*] Pambıqdan toxunan qalın və davamlı parça növü.

**CİNSİ** *sif.* [*ər.*] Cinsə aid olan, cinslə bağlı olan, cinsi göstərən. *Cinsi əlamət. Cinsi hüceyrə. Cinsi tərbiyə. – Miçurin cinsi hibridləşdirmə üsulu ilə aldığı hibrid bitkiləri münbit olmayan qumsal torpaqlarda becərmiş və bu yolla bir sıra şaxtayadavamlı və yüksək keyfiyyətə malik olan meyvə çeşidləri almışdır.* M.Abutalıbov.

**CİNSİYYƏT** *is.* [*ər.*] *biol.* 1. Cins, cins xüsusiyyəti; hər hansı bir cinsə mənsubiyyət. *Cinsiyyət hüceyrələri. Cinsiyyət səsləşməsi.*

– *Cürbəcür bioloqlar cinsiyyət və irsiyyət haqqında cild-cild elmi əsərlər yazmışlar.* M.Rzaquluzadə.

2. *köhn.* Tənasül.

**CİNSLƏŞDİRİLMƏ** "Cinsləşdirilmək"-dən *f.is.*

**CİNSLƏŞDİRİLMƏK** *f.* Cinsi, keyfiyyəti yaxşılaşdırılmaq.

**CİNSLƏŞDİRMƏ** "Cinsləşdirmək"dən *f.is.*

**CİNSLƏŞDİRMƏK** *f.* Seleksiya və s. üsullarla cinsi, keyfiyyəti yaxşılaşdırmaq. *İnəkləri cinsləşdirmək.* – [Muxtar Firəngizə:] *Qoyunu cinsləşdirmək sahəsində elmi iş aparacağam.* B.Bayramov.

**CİNSLİK** *is.* Cins heyvanın keyfiyyəti. // *sif.* Cinsini yaxşılaşdırmaq üçün ayrılmış, döllük, damazlıq. *Cinslik qoç. Cinslik inək.*

**CİN-ŞƏYATİN** *top.* [*ər.*] Cinlər və şeytanlar (nağıllarda, əfsanələrdə insanın gözünə görünən mövhumi qorxulu məxluqlar). *..Cin-şəyatin, qulyabanı, suadamı barəsində bütün eşitdiklərim gəlib gözümün qabağında durdu.* M.Rzaquluzadə.

**CİRƏ**[1] *is. bot.* Xırda ağ çiçəkləri olan birillik bitki (toxumlarından ədviyyə kimi istifadə edilir).

**CİRƏ**[2] *is.* Ərzaq payı, pay. *..Kənddən çıxdıqlarının onuncu günü Səriyyə xala yemək ehtiyatının tükənməyə başladığını hiss etdi. Gündəlik cirəni xeyli azaltdı.* M.İbrahimov. *Hər üç-dörd ayda, hər kənd təsərrüfatı kompaniyasının axırında bir təriflənmək* [Rüstəm kişinin] *cirəsi idi.* M.İbrahimov. // Norma. *Hər suçunun cirəsi gündə bir hektar yer suvarmaqdır.* Ə.Vəliyev.

**CİRİNG-CİRİNG** *təql.* Şüşə, saxsı qabların biri-birinə və ya başqa bir şeyə toxunmasından çıxan səs. *İçərişəhərin geniş alaqapılarından və daş darvazalarından içəriyə hücum çəkən külək pəncərələri ciring-ciringə salır, az qala üçmərtəbəli binanı yerindən uçurub-dağıtmaq istəyirdi.* S.Rəhimov.

**CİRİNGİLDƏMƏ** "Ciringildəmək"dən *f.is.*

**CİRİNGİLDƏMƏK** bax **cingildəmək**. *Qadir evin bir küncünə, elə belə xalça üstünə uzanmaq istərkən, baş qapının iri zəngi ciringildədi.* Ə.Əbülhəsən.

**CİRİNGİLTİ** bax **cingilti**. *..Sərkar Həmdulla bu ciringiltilərin, kişnərtilərin, nərilti-gurultunun müqabilində döyükürdü.* S.Rəhimov.

**CİSİM** *is.* [*ər.*] 1. Fəzanın müəyyən bir qismini dolduran maddə, materiya, şey; fəzada ayrıca şey. *Bərk cisimlər. Maye cisimlər. Cisimlərin düşmə qanunu. Göy cisimləri* (*planetlər, ulduzlar*). // *riyaz.* Eni, uzunu, dərinliyi olan şey. *Həndəsi cisimlər.*

2. Bədən, vücud. *Oğlan, sən uşaqsan, cavansan hələ; Yenicə cisminə düşüb vəlvələ.* M.P.Vaqif. *Yandırır cismimi eşqin havası; Bimürvət, demirsən, qar sinəmdə var.* Aşıq Ələsgər. // Cənazə. *Cismi yalnız gömülmüşdür; Qəbrə, parlaq gözəl əməlləri yox!* S.Rüstəm.

**CİSİMCİK** *is.* Kiçik cisim. *Qan cisimcikləri.*

**CİSMANİ** *sif.* [*ər.*] 1. Cismə mənsub, maddi.

2. Bədənlə, vücudla, bədən quruluşu ilə bağlı olan. *Cismani yorğunluq. Cismani işgəncə.* – [Kavus Milnirə:] *Cismani gözəlliyə bir ruhani hüsn də əlavə olunarsa, tam bir ahəng vücuda gələr.* Çəmənzəminli.

3. *kit.* Maddi, maddi əsaslara dayanan (*ruhən* ziddi). *Cismani aləm.* // Şəhvani, insanın nəfsi ilə bağlı, ondan irəli gələn. *Cismani hisslər. Cismani yaxınlıq.*

**CİSMƏN** *zərf* [*ər.*] Bir cisim olaraq, bir varlıq kimi; bədəncə. *Cismən ayrılmaq.* – *Cismən cərgəmizdə yoxsan da əgər; Sənət dünyasında həmişə varsan.* S.Rüstəm. *Bugünkü işləri ilə ..* [qız] *cismən ölüb getmiş atasını ruhən yaşatmağa başlamışdı.* S.Rəhman.

**CİVAR** *is.* [*ər.*] Ətraf, yaxın yerlər, ətraf yerlər. [Səfərin] *atası Qarabağ xanının Naxçıvan civarında olan bir vuruşmasında öldürülmüş*(*dü*). Çəmənzəminli. [Cəmil bəy Bəypolada:] *Oturalım, burası qədər gözəl, baxımlı bir yer bu civarda çox az bulunur.* H.Cavid. *..İdrisin batalyonu düşmən müdafiəsini birinci olaraq yarıb, şəhərin civarlarına yaxınlaşan ön hissələr içərisində idi.* Ə.Məmmədxanlı.

**CİV-CİV** *təql.* Körpə quşların çıxardığı səs.

**CİVƏ** *is.* Gümüşü-ağ rəngdə ağır duru metal; kimyəvi element. *Civə və onun birləşmələri zəhərlidir.*

◊ **Civə kimi** – bir an yerində durmayan, ələ-ovuca sığmayan adam, yaxud şey haqqında (müqayisə məqamında işlənir). *Elçin ucaboylu, civə kimi oynaq bir oğlan idi.* M.Rzaquluzadə. *Carçıyevin gözləri civə kimi oynadı.* İ.Hüseynov.

**CİVƏLİ** *sif.* İçərisində, yaxud tərkibində civə olan. *Civəli termometr.*

**CİVHACİV** *zərf* Durmadan civildəyərək, civ-civ səs çıxararaq. *Quşlar civhacivlə uçuşurdular.* // Vıyıltı ilə, vıyıldayaraq. *Yanına civhacivlə tökülən güllələrə əhəmiyyət verməyib .. özünü bölüyə yetirdi.* Ə.Əbülhəsən.

**CİVİLDƏMƏ** "Civildəmək"dən *f.is.*

**CİVİLDƏMƏK** *f.* Civ-civ (civil-civil) eləmək, civilti səsi çıxarmaq. *Nurəddin gözlərini dolandıranda gördü ki, bir yuvadan dörd sərçə balası başlarını bayıra çıxarıb civildəyirlər.* S.S.Axundov.

**CİVİLDƏŞMƏ** "Civildəşmək"dən *f.is.*

**CİVİLDƏŞMƏK** *qarş.* Ağız-ağıza verib birlikdə civildəşmək. [İsmət:] *İştə bahar olmuş, hər yer gülümsər; Quşlar civildəşir, bülbüllər ötər.* H.Cavid. *Qaratoyuq balaları; Kol dibində civildəşir.* B.Vahabzadə. *Sərçələr çəpərlərin üstündə, söyüd ağaclarının təpəsində civildəşirdi..* Ə.Abasov.

**CİVİLTİ** *is.* Quş balalarının və bəzi xırda həşəratların çıxardığı nazik səs. *Quşlar ol dadlı civiltilə oxur; Aç gözün uyqudan, ey tifli-qəyur.* A.Səhhət. [Sərçələrin] *anaları uçub yuvanın ağzına qondu. Balaları sarı ağızlarını açıb civiltini bərkitdilər.* S.S.Axundov. *Səhəri həmişə şaqraq civilti və cəh-cəhləri ilə qarşılayan meşə nəğməkarları susmuş*(*du*). M.Rzaquluzadə.

**CİVİLTİLİ** *sif.* Civilti ilə olan. *Ötüşən quşların civiltili nəğməsi eşidilirdi.* M.Rzaquluzadə.

**CİYƏ** *is.* Nazik, möhkəm ip. *Tazı sahibinin əlində isə uzun ciyə olardı.* H.Sarabski. *Onların birinin* [nökərlərin] *qoltuğunda bükülü kisə, o birinin əlində möhkəm ciyə vardı.* M.İbrahimov.

**CİYƏR: ağ ciyər** *anat.* – insan və onurğalı heyvanlarda döş qəfəsində yerləşən tənəffüs orqanı (bu mənada adətən ciyər şəklində işlənir). *Həkim Həsənin ciyərində kiçik bir ləkə olduğunu söylədi.* Çəmənzəminli. [Heydərqulunun] *kürəyindən dəyən güllə sol ciyərini parçalayaraq döşündən çıxmışdı.* Ə.Sadıq. **Qara ciyər** – insan və heyvan bədəninin öd hasil edən və maddələr mübadiləsi ilə bağlı bir sıra mühüm prosesləri törədən daxili orqanı; bağır.

◊ **Ciyər dolusu** – dərindən. *Göyçək ciyər dolusu nəfəs alıb köksünü ötürdü.* Ə.Vəliyev. **Ciyər eləmək** – ürək eləmək, ürəklənmək, cəsarət etmək. *Səd parə könül, xövf eləmə tiri-bəladən; Mərdanə bu meydanə qədəm qoy, ciyər eylə.* S.Ə.Şirvani. **Ciyəri dağlanmaq** – b a x **ciyəri yanmaq**. **Ciyəri qana dönmək** – bərk mütəəssir olmaq, ürəyi qan olmaq. *Ciyərim qanə dönüb, dərdü bəla gördüm əcəb.* S.Ə.Şirvani. **Ciyəri odlanmaq** – 1) b a x **ciyəri (od tutub) yanmaq**; 2) susuzluqdan yanmaq. **Ciyəri (od tutub) yanmaq** – bərk mütəəssir olmaq, acımaq. *Zakirinəm, ey bivəfa dilbərim; Qoy baxsın üzünə həsrət gözlərim; İntizar çəkməkdən yanır ciyərim.* Q.Zakir. *Qulu kişi bərk ufuldadı. Elə bil ciyəri od tutub yandı.* H.K.Sanılı. **Ciyərin yansın!** – qarğış ifadəsi. [Telli:] *Məni qınayan, ciyərin yansın!* Ə.Məmmədxanlı. **Ciyərinə od düşmək** – b a x **ciyəri (od tutub) yanmaq (odlanmaq)**. *Buyurdular ki, vallahi, hər bir qoca, cındır libasda hammal görəndə ciyərimə od düşür, nəfəsim darıxıb az qalır ki, bihuş olub yıxılam.* N.Vəzirov. **Ciyərini çıxardaram!** – hədə, qorxu ifadəsi. **Ciyərini dağlamaq (yandırmaq)** – b a x **ürəyini yandırmaq ("ürək"**də). [Düşmən başçısı] *Qazan xandan hayıf almaq,* [xanın] *ciyərini dağlamaq istəyirdi.* M.Rzaquluzadə. **Ciyərini kabab eləmək (etmək)** – b a x **ciyərini dağlamaq**. **Ciyərinin başı sökülmək** – ürəkdən acımaq, halına yanmaq, bərk mütəəssir olmaq. *Xəstə uşağı gördüm, ciyərimin başı söküldü.*

**CİYƏRGUŞƏ** *is.* [*fars.*] Çox sevimli övlad (adətən tək uşaq) mənasında. [Vəzir:] *..Hələ mənə bir möhlət ver ki, özümü xanın yanına yetirib sənin ciyərguşənin axırına çıxım, sonra sənin haqqına fikir çəkərəm.* M.F.Axundzadə. *Gər dəysə soyuq, sancılanıb olsa da bimar; Hökm et gələ cindar; Göstərmə təbibə o ciyərguşəni, zinhar.* M.Ə.Sabir.

**CİYƏRİYANMIŞ** *sif.* və *is.* Qarğış sözü.

**CİYƏRLİ** *sif.* Ürəkli, cəsarətli, qoçaq, qorxmaz. *..Məhərrəm də ciyərli kişi idi.* M.Süleymanov.

**CİYƏRPARƏ** [*fars.*] b a x **ciyərguşə**. [Şeyx Amiri Şeyx Haşimiyə:] *Mən də eşitmişəm, bilirəm ki, sənin ciyərparən, yeganə qız övladın misilsiz bir nazənindir.* Ə.Məmmədxanlı. *Sənin ciyərparəni mən sevirəm, nə olar? Göz gördü, könül sevdi, mənim nə günahım var.* B.Vahabzadə.

**CİYƏRSUZ** *sif.* [*fars.*] *klas.* Ürəkyandıran, yanıqlı. *Leyli demə – şəmi-məclisəfruz; Məcnun demə – atəşi-ciyərsuz.* Füzuli. *Salaməleyküm, ağa Dərviş! Oğlan, genə nə var, nə olub, bu nə cigərsuz qəsidədir?* N.Vəzirov.

**CİYİL** b a x **kol-kos**.

**CİYİLLİK** b a x **kol-kosluq**.

**CİZGİ** b a x **xətt²**. *Kosa dik bir cizgi çəkir, sonra yanlardan onu qarmaqla bağlayır.* S.Rəhimov. *Gözlərinin kənarlarından gicgahlarına doğru uzanan cizgilər onu daim gülümsər göstərirdi.* M.Rzaquluzadə.

**CİZGİLƏMƏ** "Cizgiləmək"dən *f.is.*

**CİZGİLƏMƏK** *f.* Cizgi çəkmək, xətləmək, cızıqlamaq.

**CİZGİLİ** *sif.* Cizgi çəkilmiş, cizgiləri olan, xətli, cızıqlı.

**CİZYƏ** *is.* [*ər.*] *köhn.* Müsəlman ölkələrində müsəlman olmayanlardan əsgərlik xidməti müqabilində alınan vergi.

**COD** *sif. dan.* Qaba, kobud, sərt, qalın. *Sən məni bazarda çustumla; Cod parçadan kostyumla görmüşdün.* R.Rza. *Üzünün oraburasında bitən cod tüklərin hər biri qara tikana bənzəyirdi.* S.Rəhman. *Sultan cəld bir hərəkətlə .. cod və çal bığını sığallayıb qədəhləri doldurdu.* İ.Hüseynov.

◊ **Cod su** – tərkibində çoxlu əhəng duzları olan su. *Cod su dərini qıcıqlandırır.*

**CODLANMA** "Codlanmaq"dan *f.is.*

**CODLANMAQ** b a x **codlaşmaq**.

**CODLAŞMA** "Codlaşmaq"dan *f.is.*

**CODLAŞMAQ** *f.* Cod olmaq, zərifliyini, incəliyini itirmək; kobudlaşmaq, qabalaşmaq, sərtləşmək. *Tükləri codlaşmaq.* // Məc. mənada. *Hidayət yenə də təmkinini saxlamağa çalışsa da, codlaşdı, açılışdı.* B.Bayramov. *Üzünü niyə yana tutursan, ə, eşitmirsən? – Dilavərin səsi codlaşdı.* V.Şıxlı.

**CODLUQ** *is.* Cod şeyin halı, keyfiyyəti. *Dərinin codluğu. Tükün codluğu. Yunun codluğu. – Suyun codluğunu və ya yumşaqlığını təyin etmək üçün ona sabun vururlar.* Ə.Əlizadə.

**CODYUNLU** *sif.* Yunu cod, qaba olan. *Codyunlu qoyun.*

**COĞRAFİ** *sif.* Coğrafiyaya aid, coğrafiya ilə bağlı. *Coğrafi kəşflər. Coğrafi xəritə.* // Hər hansı bir yerin təbii şəraiti, quruluşu və ya vəziyyəti baxımından qiymətləndirilən, baxılan, nəzərdə tutulan. *Coğrafi landşaft. Ölkənin coğrafi vəziyyəti. Sənayenin coğrafi yerləşdirilməsi. – Elmi dəlillər Abşeron yarımadasındakı tükənməz sərvəti saxlayan təbəqələrin dənizdə də davam etdiyini göstərir, coğrafi sərhədi şərti bir şey hesab edirdi.* M.Süleymanov. **Coğrafi mühit** – cəmiyyətin maddi həyatının ən zəruri və daimi şərtlərindən biri olan təbii şərait (iqlim, torpaq, təbii sərvətlər və s.).

**COĞRAFİYA** [*yun.* gegraphia – Yerin təsviri] Təbii və istehsal ərazi komplekslərini tədqiq edən təbiyyat və ictimai elm sahəsi. □ **İqtisadi coğrafiya** – ictimai istehsalın yerləşməsi və müxtəlif ölkələrdə və rayonlarda onun inkişaf şəraiti və xüsusiyyətlərindən bəhs edən elm. **Fiziki coğrafiya** – insan cəmiyyətini əhatə edən təbii şəraiti (relyef, iqlim, bitki və heyvan aləmi, torpaq və i.a.) öyrənən elm. // Yer üzündə bir şeyin yayılması haqqında tədqiqat. *Bitki coğrafiyası. Heyvanlar aləminin coğrafiyası. Torpaqların coğrafiyası.* // Coğrafiyadan bəhs edən fənn. *Coğrafiyadan tapşırıq. Coğrafiyadan imtahan vermək. Coğrafiya müəllimi.* // Coğrafiyadan dərs kitabı, dərslik.

◊ **Dilçilik coğrafiyası** – dilçiliyin, ayrı-ayrı dil hadisələrinin (fonetik, qrammatik, leksik) yayılması hüdudlarını öyrənən bəhsi.

**COĞRAFİYAÇI** b a x **coğrafiyaşünas**. *Coğrafiyaçıların konfransı.*

**COĞRAFİYAŞÜNAS** [*yun.* coğrafiya və *fars.* ...şünas] Coğrafiya alimi, coğrafiya mütəxəssisi. *Coğrafiyaşünas professor.*

**COĞRAFİYAŞÜNASLIQ** *is.* Coğrafiya tarixi və nəzəriyyəsindən bəhs edən elmlərin məcmusu.

**COMƏRD** *is.* Mərd, alicənab. *Comərd igid heç qaçarmı meydandan; Qılınc çəkib hayıf alar düşməndən.* "Koroğlu". [Qadın:] *Çox sağ olun, mən sizi comərd oğlan tanımasaydım, heç qapımı üzünüzə açmazdım.* M.S.Ordubadi. *Mənim zabitlər arasında da çox comərd yoldaşlarım vardır.* M.İbrahimov. // Əliaçıq, səxavətli.

**COMƏRDCƏSİNƏ** *zərf* Comərd adama yaraşan bir tərzdə; alicənabcasına, mərdcəsinə. *Comərdcəsinə özünü qabağa verdi.*

**COMƏRDLƏŞMƏ** "Comərdləşmək"dən *f.is.*

**COMƏRDLƏŞMƏK** *f.* Özünü igid, mərd kimi aparmaq, kişiləşmək, əliaçıqlıq, səxavət göstərmək.

**COMƏRDLİK** *is.* Mərdlik, nəciblik, alicənablıq. [Kərim baba:] *Özümü itirdim. Lakin qorxmurdum, çünki bu igid heyvanın comərdliyindən əmin idim.* A.Şaiq. // Səxavətlilik, əliaçıqlıq; səxavət.

**CORAB** *is.* Yun, iplik və ya süni sapdan toxunan uzun və ya qısa boğazlı ayaq geyimi. *Naxışlı corab. Yun corab. – Həsən cırıq corabını göstərməmək üçün çəkməsini masanın kölgəsində çıxartdı..* Çəmənzəminli. *Səkinə talvar taxtasından asılmış otuzluq neft lampasının işığında oturub Pərşana qış corabı toxuyur...* M.İbrahimov. *Qərənfil bacının .. ayaqlarında ipək corabla yüngül məst var idi.* İ.Əfəndiyev.

**CORABBAĞI** *is.* Corabı ayaqda saxlamaq üçün rezin, bağ və s.

**CORABLI** *sif.* Corab geymiş, ayağında corabı olan.

**CORABTOXUYAN** *is.* Corab toxumağa məxsus maşın; corab toxuyan işçi. // Sif. mənasında. *Corabtoxuyan maşın. Corabtoxuyan qız.*

**COŞDURMA** "Coşdurmaq"dan *f.is.*

**COŞDURMAQ** *f.* 1. Qızışdırmaq, şiddətləndirmək, bütün gücü ilə təzahür etdirmək. *Hələ bu qadının munis və təvazökar bir qadın olması da insanın məhəbbətini coşdururdu.* M.S.Ordubadi. *Həyatbəxş və həssas bir hava* [Muxtarla xanıma] *təmas edərkən qıdıqlandırdı, coşdurdu.* Çəmənzəminli.

2. Hirsləndirmək, acıqlandırmaq, qızışdırmaq, özündən çıxarmaq. *Maya bir də ona görə Rüstəm kişinin qəzəbini coşdururdu ki, evində yetişmiş Pərşan vardı.* M.İbrahimov. *Hidayəti coşduran hər şeydən çox Sənubərin indiki halda belə sakitləşməsi, beləcə duyğusuz kimi laqeyd əyləşməsi idi.* B.Bayramov.

**COŞQUN** *sif.* 1. Coşmuş halda olan; qızışmış.

2. Bütün gücü, şiddəti ilə təzahür edən; güclü, gur, şiddətli; təlatümlü. *Coşqun sel. – Saz o qədər məharətlə çalınırdı ki, nəğmə coşqun sular kimi axıb yayılırdı.* A.Şaiq. *Coşqun Xəzər oynar ayaqlarında; İşıq saçan nefti torpaqlarında; Tarixlərin qızıl yarpaqlarında; Dadlı-dadlı sözləri var ölkəmin.* C.Cabbarlı.

3. *məc.* Qızğın, güclü, şiddətli, hədsiz. // *məc.* Ehtiraslı, qızğın, atəşin, həyəcanlı. *Coşqun nitq. Coşqun baxışlar.* // *məc.* Dəliqanlı. *..Professor bu aramsız, diribaş, coşqun gəncdən çox şey gözləyirdi*. M.Rzaquluzadə.

**COŞQUNLAŞMA** "Coşqunlaşmaq"dan *f.is.*

**COŞQUNLAŞMAQ** *f.* Coşqunluğu artmaq, qızışmaq, şiddətlənmək. *Dəniz getdikcə coşqunlaşırdı.*

**COŞQUNLUQ** *is.* Coşqun şeyin halı; coşqun, həyəcanlı hal. *Hər kəs dəli bir qan coşqunluğu ilə irəliləyir, irəliləyirdi.* H.Nəzərli.

**COŞMAQ** *f.* 1. Şiddətlənmək, çox güclənmək, gurlamaq, tüğyan etmək; daşmaq, kükrəmək (təbiət hadisələri haqqında). *Tufan getdikcə coşur. Dəniz coşmuşdu. – Bu çaylar coşar indi; Qaynayıb daşar indi; Gözüm dağlarda qalıb; Yar gəlib aşar indi.* (Bayatı). *Kükrəsin şəlalə; Coşsun, çağlasın; Dağların ərköyün balasıdır o.* N.Xəzri. *..Dəniz Ümidin xəyalları kimi coşub çaxnaşırdı.* B.Bayramov. // *məc.* Qızışmaq, qaynamaq, cuşa gəlmək. *..Məhəbbət coşdu, məni bürüdü, "Ruqiyyə, Ruqiyyə" dedirtdi.* A.Divanbəyoğlu. [Qubernator:] *İnsan qan yığdıqca coşar, qan verdikcə susar.* C.Cabbarlı.

2. *məc.* Özündən çıxmaq, hirslənmək, qızışmaq, qəzəblənmək. *Coşub, qabağını saxlamaq mümkün deyil. Niyə belə coşmusan? – Tahir istər-istəməz təmkinini pozaraq*

*coşdu.* S.Rəhimov. [Usta:] *Ay arvad, ay Gülpəri, coşma görək, axır nə olub ki?* M.Hüseyn.

**COŞUB-DAŞMA** "Coşub-daşmaq"dan *f.is.*

**COŞUB-DAŞMAQ** *f.* 1. Güclənmək, şiddətlənmək, artmaq, gurlamaq, kükrəmək. *Sel coşub-daşır. – Bu çay coşub-daşanda nə qanlar eləməmişdi.* Çəmənzəminli. *Külək də birdən əsdi; Coşdu-daşdı dalğalar.* H.Hüseynzadə. [Camal:] *Qorxma, uçmaz, dəniz nə qədər coşub-daşsa da, heç nə eləyə bilməz.* M.Süleymanov.

2. B a x **coşmaq** 2-ci mənada. *Bu söz üzərinə şişman adam coşdu-daşdı, ağzı köpüklənərək: – Bu sözün sənə neçəyə mal olacağını bilmirsən?* A.Şaiq.

3. *məc.* Bir şeyin çoxluğunu, güclü təzahürünü bildirir. *Tarlada iş coşub-daşır. Bu əlamətdar günlərdə xalqın yaradıcılıq əzmi coşub-daşır.*

**CÖKƏ** *is. bot.* Diş-diş yarpaqları və bol şirəli, ətirli çiçəkləri olan ağac. *Cökə 20-25 metr hündürlükdə, qışda yarpağı tökülən ağacdır. Ətirli çiçəkləri iyunda açılır, meyvəsi sentyabrda yetişir, çiçəklərindən arılar bal şirəsi yığır, toxumu yağlıdır, bəzən yeyilir: çiçəyi tərlədici dərman kimi işlədilir, oduncağı yüngül və möhkəmdir.* H.Qədirov.

**CÖKƏLİK** *is.* Cökə ağacları bitən yer, cökə meşəsi.

**CÖNGƏ** *is.* Erkək, yeniyetmə, cavan inək balası. *Qəhrəman meşənin dərinliyində ..ala cöngəni sığallayıb tumarlayırdı.* S.Rəhimov. *Yelinləri südlə şişmiş inəklər mələşə-mələşə, xam cöngələr böyürə-böyürə .. özlərini bulaqların üstünə saldılar.* Ə.Abasov.

**CÖVHƏR** *is.* [*ər. əsli farsca* "gövhər"dən] 1. Hər hansı bir üzvi maddənin distillə və s. kimyəvi üsulla ayrılan yığcam məhlulu, şirəsi. *Nanə cövhəri* (bax **cövhərnanə**). ☐ **Cövhərini çəkmək** – distillə etmək, distillə vasitəsilə cövhərini, xülasəsini almaq.

2. *köhn.* Neft, ağ neft. [Hacı Sultan] *Hərdən qənd və cövhər də alıb satır..* S.Hüseyn. [Şərəf xala:] *Qəbir üstünə getmişdim. Gec qayıtdım. Cövhər ala bilmədim, dükanlar bağlı idi.* H.Sarabski.

3. *məc.* Bir şeyin (əsərin, sənədin, yazının, nitqin və s.-nin) qısa, yığcam xülasəsi, əsas qayəsi, məğzi: əsil mətləb. // *məc.* Əsil, mayə, zat, kök. *Eşq dərdi, ey müalic qabili-dərman deyil; Cövhərindən eyləmək cismi cüda asan deyil.* Füzuli.

**CÖVHƏRNANƏ** b a x **nanə cövhəri (arağı)** (**"nanə"**də).

**CÖVLAN** *is.* [*ər.*] Dolanma, hərlənmə, dövri hərəkət; dövretmə, dövran. *Könlüm bulanır küçədə cövlanını görcək; Nitqim tutulur hərzəvü hədyanını görcək.* M.Ə.Sabir. *Qarlı küləyin cövlanı sakitləşmək əvəzinə daha qüvvətlə davam eləməkdə idi.* B.Bayramov. ☐ **Cövlan etmək (vurmaq)** – dolanmaq, hərlənmək, fırlanmaq, dövr etmək, dövrə vurmaq. *Odur, atlılar dəstə-dəstə, ya tək-tək uzaqdan görsənirlər. Bir qeyriləri də şəhərdən çıxıb aşağı tərəf çapırlar, bunlar hamısı cövlan edirlər.* C.Məmmədquluzadə. [Dəli Səmədin] *axşamadək peşəsi şəhəri cövlan etmək idi.* Çəmənzəminli. *Bəndalı qəfəsdən çıxmış aslan kimi cəld balaca açıq həyətdə bir cövlan vurdu.* Mir Cəlal. **Cövlana çıxmaq** – gəzməyə, dolanmağa çıxmaq. *Əlioğlu Qara oğlan xallı atın belində cövlana çıxmışdı.* S.Rəhimov. *Gəl, gəl çıxaq cövlana; Qoy qızışsın ortalıq.* M.Rahim.

**CÖVLANGAH** *is.* [*ər.* cövlan və *fars.* ...gah] Gəzinti yeri, seyr yeri, seyrgah.

**CÖVR** *is.* [*ər.*] Cəfa, zülm, əziyyət; incitmə, üzüntü. *Fəqirə aid olan föhşü, cövrü, zülmü, cəfanı; Böyükdə, zorbada, bəylərdə, xanda görməli imiş.* M.Ə.Sabir. *Nola qəlbim, anam kimi ananın; Hər cövrünə, hər nazına dayana.* B.Vahabzadə. ☐ **Cövr eləmək (etmək)** *klas.* – incitmək, əzab vermək, əziyyət vermək, cəfa vermək, üzüntü vermək. *Yar cövr etməz mana əğyar təlim etmədən; Billah, əğyar eyləyən ehsanı yar etməz mana.* Füzuli. *Səndən savayə cövr eləməz yar, ey könül; Netdin ki, sən bu lütfə səzavar olmusan?* S.Ə.Şirvani. *Ol qədr cövr et mənə, ah etmək imkan olmasın!* M.Ə.Sabir. **Cövrünü çəkmək** – hər əzabına dözmək, hər dərdinə, əziyyətinə qatlaşmaq. [Qurbani:] *Bir gör fələkin dövrünü; Mən çəkmişəm çox cövrünü..* "Qurbani". [Məşədi Cahangir:] *Sənin cövrünü hər yerdə ləłəşin çəkib, çəkəcək!* Mir Cəlal.

**CÖVR-CƏFA** *is.* [*ər.*] *klas.* B a x **cövr**. *Bən nə təriqü vəchlə cövrü cəfadən usanım; Çünki həmişə yarımın cövrü cəfası yarədi.* Nəsimi.

*Ey bivəfa, məni cana yetirdin; Bunca cövrü cəfa birdən olurmu?* Q.Zakir. ☐ **Cövr-cəfa etmək (eləmək)** – zülm etmək, əzab vermək, incitmək. *Hər qədər eyləyəsən cövrü-cəfa; Mən sənə eyləməzəm qeyri-vəfa.* S.Ə.Şirvani.

**CÖVÜZ** *is.* Qoz. *Dərin dərələrin içindən üzüyuxarı dikələn və hər tərəfə alaçıq kimi yayılan irişaxəli qoz ağacları öz balaca göy cövüzləri ilə dayanıb dururdular.* S.Rəhimov.

**CÖVÜZQIRAN** *is.* Qoz sındırmaq üçün alət; qozsındıran.

**CÖVZƏ** b a x **kəm²**.

**CUBBULU** b a x **cumbulu**.

**CUHUD** *dan.* Bax **yəhudi**. *Əttarların ləzzəti cuhudun evi bağlanandan bəri qaçıb.* Ə.Haqverdiyev. *Buynakski küçədən qoca bir cuhud arvadı dəstəyə gəlib soruşdu..* Qantəmir.

**CUQQULDAMA** "Cuqquldamaq"dan *f.is.*

**CUQQULDAMAQ** *f.* 1. B a x **cikkildəmək**.

2. *məc.* Ötmək, birnəfəsə danışmaq. *Nə cuqquldayırsan?*

**CULFA** *is. köhn.* Əl hanasında pambıq parça toxuyan adam, toxucu. *Culfa kəfənsiz ölər.* (Ata. sözü). *Atam əllaf, babam dülgər idi; Qardaşım culfa, əmim kargər idi.* M.Ə.Sabir.

**CULFALIQ, CULFAÇILIQ** *is.* Culfanın işi, peşəsi, sənəti. [Fatmanisə:] *Almazın atası səhərdən- axşamacan onun-bunun qapısında culfalıq eləyirdi.* C.Cabbarlı. *Qayadalı kəndinin əhalisi isə xüsusilə culfaçılıqla məşğul olmuşdur.* "Elm və həyat".

**CUMBULU** *sif. dan.* Çox kiçik, çox balaca, bambalaca. *Cumbulu uşaq.*

**CUMBULULUQ** *is. dan.* Balacalıq, kiçiklik.

**CUMDURMA** "Cumdurmaq"dan *f.is.*

**CUMDURMAQ** *icb.* 1. Sürətlə, tez, cəld qaçırtmaq.

2. Hücum etdirmək, hücuma təhrik etmək, məcbur etmək.

**CUMMA** "Cummaq"dan *f.is.*

**CUMMAQ** *f.* 1. Sürətlə, cəld qaçmaq, cəld getmək, ayaq alıb gəlmək, ya getmək. *Evə cummaq. Adamlara tərəf cummaq. – ..Pristav özü atdan düşüb, içəriyə cumdu.* M.Hüseyn. *Sənəm .. çuvallara tərəf cumdu.* Ə.Əbülhəsən. // *məc.* Üstünə atılmaq, həmlə etmək. *O qədər xoşlanıram tüstüsü çıxcaq kababın; Ac pişiktək cumuram şövq ilə birbaşa ətə.* M.Ə.Sabir.

2. Dalmaq, baş vurmaq. *Suyun dibinə cummaq.* // Məc. mənada. *Ələsgər qurbandı belə gəlinə; Sonatək cumubdur eşqin gölünə.* Aşıq Ələsgər. *..Kişi sözünü deyib dik-dik baxdı Məhəmməd Həsən əminin üzünə, qeyriləri də gözlərini dikib yerə, fikrə cummuşdular..* C.Məmmədquluzadə.

**CUMUXMAQ** b a x **cummaq**.

**CUNA, CUNAYI** b a x **tənzif**. *..Yasəmən uşağı beşiyə qoyub, cuna ilə üzünü örtür.* S.S.Axundov. // Tül rübənd, qaz-qaz, qaz örtük. *Gülpərinin üzünə, köhnə toylarda olduğu kimi, cuna çəkmişdilər.* M.Hüseyn.

**CUNALI** *sif.* Başına, ya üzünə cuna salmış. // Rübəndli, tüllə örtülü. *Atalı, analı gözəl; Ağ üzü cunalı gözəl; Əlləri xınalı gözəl; Gözəl, sənin vəfan yoxmuş.* (Qoşma).

**CUNQUŞ** b a x **cumbulu**. *Cunquş oğlan.*

**CUR** *is.* Özünə tay, bərabər; yoldaş, həmtay, bir yerdə oturub-duran yoldaşlardan hər biri. *Qızxanım curları ilə duvaqqapmada şirin söhbətə məşğul ikən Vaqif də Mədinənin vüsalına qovuşurdu.* Çəmənzəminli. ☐ **Cur olmaq** – yoldaş olmaq, həmtay olmaq. [Mirzə Cavad:] *Bir yandan mənim kimi subaysoluq ilə cur olursan, oturub-durursan, o biri yandan da nədir, o naxoş kişinin detyaslisinə gedirsən..* Mir Cəlal.

**CUR-CUR** *təql.* Acından bağırsaqlarda əmələ gələn səs. ☐ **Cur-cur eləmək** – curuldamaq. [Almaz:] *Acından qarnımız curcur eyləyir.* N.Vəzirov.

**CURLAŞMA** "Curlaşmaq"dan *f.is.*

**CURLAŞMAQ** *f.* Yoldaş olmaq, dost olmaq, həmtay olmaq.

**CURULDAMA** "Curuldamaq"dan *f.is.*

**CURULDAMAQ** *f.* Cur-cur eləmək, quruldamaq. *Qarnı curuldamaq. – Öküz inildəməkdən qarnı curuldayır.* Ə.Vəliyev.

**CUŞ** *is.* [*fars.*] Coşma, qaynama; qələyan, həyəcan. ☐ **Cuş eyləmək** – coşmaq, qələyana gəlmək, qaynamaq, cuşa gəlmək, qızışmaq. [Harun:] *Eşqimiz cuş eyləyib artmaqdadır gündən-günə.* Ü.Hacıbəyov. **Cuşa gəlmək** – coşmaq, qızışmaq, vəcdə gəlmək, şövqə gəlmək. *Tahir ..daha da cuşa gəlib, sazın tellərini lap ürəkdən ehtizaza gətirirdi.*

M.Hüseyn. [Aşıq:] *Sinəm cuşa gəldi, mən sazı alıb "Xoş gəlib" rədifli sözümü ovşarı havası ilə oxudum.* A.Şəmşir.

◊ **Cuşa gətirmək** – ruhlandırmaq, canlandırmaq, vəcdə gətirmək, şövqləndirmək. *Şərqdən əsən nəsim güllərin, çiçəklərin və ağacların yarpaqlarının arasında aşiq və məşuqlar ürəklərini cuşa gətirən* (f.sif.) *bir məqamat bərpa etmiş idi.* Ə.Haqverdiyev. **Qanı cuşa gəlmək** – b a x **qan qaynamaq** (**"qan"**da). *Zeynal oğlunu görcək qanı bədənində cuşa gəldi.* Çəmənzəminli.

**CUVAR** *is.* Suvarma suyunu bölüşdürən adam. *Suçıxmaz arxa cuvar qaydalar, adımı da qoydular yarıtmaz.* (Ata. sözü). *Yeganə giriş yoluna* [Əlləzoğlu] *..qəsdən su buraxıb, bir yaba tikan qoyubmuş ki, cuvar adlaya bilməsin.* İ.Hüseynov.

**CÜBBƏ** *is.* [*ər.*] Keçmişdə: üstdən geyilən uzun ətəkli, enli, düyməsiz geyim. *Qocalarımız, cavanlarımız uzun börk qoyardılar, təpəçuxa və cübbə geyərdilər.* Ə.Qəmküsar. [Vəzir Xacə Məsuda:] *Buyur, tez mənim qırmızı cübbəmi versinlər, kəhər atımı yəhərləsinlər, eşitdinmi?* M.F.Axundzadə. *Uzun tirmə cübbə geymiş məmurlar* [vəliəhdi] *əhatə etmişlər.* P.Makulu.

**CÜBBƏLİ** *sif.* Cübbə geymiş. *Bir çılpağı min cübbəli soya bilməz.* (Ata. sözü). *Ayaq üstə dolaşan şal sarıqlı, qısa cübbəli gənc bir əxi Mirzə Əbdülvahaba yer göstərdi.* Çəmənzəminli.

**CÜCƏ** *is.* Toyuq balası. *Əlimi hinə soxub, suyun içindən cücələrin cəmdəklərini bir-bir çıxartdım.* A.Şaiq. [Hörmət] *həmişə cücə və yumurta satmaqla da çörək pullarının bir qismini çıxarardı.* Ə.Sadıq.

◊ **Cücə kimi** – balaca, xırdaca, cılız, sısqa. *Cücə kimi qız. – Üst-başı toz-torpaq içində, qısaboylu, cücə kimi sısqa və iri çopur burnu qırmaq kimi əyri bir topal yumaq kimi yumalana-yumalana içəri girdi.* M.Rzaquluzadə.

◊ **İslanmış cücə kimi** – çox acınacaqlı, zavallı, yazıq görkəmi olan adam haqqında. *..Arıq adam islanmış cücə kimi büzüşüb danışığına peşman oldu.* M.Hüseyn.

**CÜCƏGÖZ** *sif.* Xırdaca gözləri olan. *Cücəgöz adam.*

**CÜCƏGÖZÜ** *is. dan.* Xal-xal. *Cücəgözü parça. – Qərənfil xala keçən il tikdirdiyi cücəgözü çit döşlüyü ilə yapışıb qazanı yerə düşürdü.* Ə.Vəliyev.

**CÜCƏPLOV** *is.* Xuruşu cücədən ibarət olan plov. [Hacı Həsən:] *Bəlkə şeyx cənabları təam buyuralar, yaxşı cücəplov bişiriblər.* C.Məmmədquluzadə. *Əlvan məzələr və içkilərlə başlayan ziyafət cücəplov və meyvələrlə bitdi.* Çəmənzəminli.

**CÜCƏRDİLMƏ** "Cücərdilmək"dən *f.is.*

**CÜCƏRDİLMƏK** *məch.* Bəslənib yetişdirilmək, becərilmək.

**CÜCƏRMƏ** "Cücərmək"dən *f.is.*

**CÜCƏRMƏK** *f.* Yetişmək, boy atmaq, torpaqdan çıxmaq, görünməyə başlamaq (bitki haqqında). *Havalar qızdıqca çiyid cücərirdi. – Yerdə göy otlar cücərdi; Geniş tarlalar göyərirdi.* M.Dilbazi. *Bayırda cücərib min gül, min çiçək; Əriyir qəlbində dağların qarı.* B.Vahabzadə.

**CÜCƏRTİ** *is.* Torpaqdan görünən, başı çıxan bitki. *Cücərti əmələ gələn gündən sahədə seyrəltmə işləri aparılır.*

**CÜCƏRTMƏ** "Cücərtmək"dən *f.is.*

**CÜCƏRTMƏK** *f.* Becərərək, bəsləyərək yetişdirmək (toxumu, bitkini). *Dəni cücərtmək.*

**CÜCÜ** *is. zool.* Milçək, arı, qarışqa kimi buğumayaqlılara verilən ümumi ad; böcək. *Amma cücülərdən bir çoxu sübh açılmasından bixəbər idi.* A.Divanbəyoğlu. [Nəzirə] *başmağının bir tayında cücü görmüş, çimçəşdiyi üçün Rübabəni çağırmışdı.* Mir Cəlal.

**CÜCÜYEYƏN** *sif. zool.* Cücü ilə qidalanan, həşərat yeyən. *Cücüyeyən quşlar.*

**CÜFT** b a x **cüt**[1] 1-ci mənada. *Təzə arvad üçün imperyala; Cüft ilə alınmış brilyant sırğa.* H.K.Sanılı.

**CÜKKÜLDƏMƏ** "Cükküldəmək"dən *f.is.*

**CÜKKÜLDƏMƏK** *f.* Cük-cük eləmək, "cük-cük" səs çıxarmaq. [Tanya Toğrula:] *Bura bax, indi də qurbağanın yerinə özün cükküldəyirsən.* C.Cabbarlı.

**CÜLGƏ** *is. məh.* Quraqlıq yerlərdə təbii nohur.

**CÜLLÜT** *is. zool.* Uzundimdikli, nazikayaqlı, tükü naxışlı köçəri quş. *Bir dəstə cül-*

*lüt qalxdı və "Qara güzgü"nün üstündən keçdi.* H.Seyidbəyli.

**CÜLUS** *is.* [*ər.*] Hökmdarın taxta çıxması. *Şah Abbasın cülusundan altı il keçib, yeddinci il başlanmışdı ki, aşağıda zikr olunan qəziyyə vaqe oldu.* M.F.Axundzadə. [Çopo:] *Ərdicanın cülusu bir o qədər də təntənəli keçmədi, xalq yorulmuşdu.* Çəmənzəminli. ◻ **Cülus etmək** – taxta oturmaq, hökmdarlığa başlamaq. [Vaqif:] *Şah cülus edərkən, İranın dörd valisi tac mərasimində iştirak etməlidir.* Çəmənzəminli. [Mirzə Sadıq:] *Şah taxta cülus edincə Mirzə Təqi xanı özünə sədriəzəm qərar verib.* C.Cabbarlı.

**CÜMƏ** *is.* [*ər.*] Həftənin beşinci günü; cümə axşamından sonra gələn gün. [Hacı:] *Hazırla, ay xalaqızı, cümə günü gələcəyəm!* Mir Cəlal. ◻ **Cümə axşamı** – həftənin dördüncü günü. [Nənəxanım:] *A kişi, .. bir yerdə yeyək, cümə axşamıdır, elə ölülərimizin də ruhu şad gedər.* Çəmənzəminli.

**CÜMƏXATAN** *is.* Sandıq, yorğan-döşək, və s. qoymaq üçün evin iç divarında düzəldilən oyuq, boş yer. *Otağın divarlarındakı cüməxatanda böyük sandıqların üstə ipək, zərzər üzlü əlvan yorğan-döşəklər qoyulardı.* H.Sarabski.

**CÜMHURİYYƏT** [*ər.*] b a x **respublika**. *Azərbaycan Xalq Cümhuriyyəti. – Meşinov bütün varlığı ilə etiraz etdi: – Yox, yox, cümhuriyyət yox, bu, bütün Şərq məsələsidir!* S.Rəhman.

**CÜMHURİYYƏTÇİ** b a x **respublikaçı**.

**CÜMLƏ** *is.* 1. *dilç.* Bitmiş bir fikri ifadə edən söz birləşməsi və ya söz. *Sadə cümlə. Sual cümləsi. Budaq cümlə.*

2. Hamı, hamısı, bütün. *Cümlə karvan əhli heyran qaldı, hamıdan da artıq bu sirrə təəccüb edən Məmməd oldu..* E.Sultanov, [Hacı Saleh:] *Yetim İmranı nə tövr saxladığım cümləyə məlumdur*. S.S.Axundov.

3. *köhn.* Miqdar, məbləğ.

**CÜMLƏQAYĞI** *sif.* və *is.* Hamının dərdini çəkən, hamıya qayğı göstərən, canyandıran, qayğıkeş. *Cümləqayğı adam.*

**CÜMLƏQAYĞILIQ** *is.* Hamının dərdinə qalma, hamının qayğısını çəkmə. *Əfruz bacı bir də özü Nənəqızı Balaxana tapşırmaq istədi. Çünki onda belə bir cümləqayğılıq xasiyyəti də vardı.* S.Rəhimov. [Allahqulu Çimnaza:] *Oğlunnan sən bəs nə qayırırsan? Cümləqayğılıq eləyirsiniz niyə? Gedib xarabanda otursana!* Ə.Əbülhəsən.

**CÜMLƏPƏRDAZ** *is.* [*ər.* cümlə və *fars.* ...pərdaz] Danışığında və yazısında qəliz, təmtəraqlı cümlələr, ibarələr işlətməyi sevən adam.

**CÜMLƏPƏRDAZLIQ** *is.* Qəliz və təmtəraqlı cümlələr, ibarələr işlətməyi sevmə. *Politexnik təlim haqqında ümumi mülahizələr yeritməkdən, cümləpərdazlıqdan və doqmatizmdən əl çəkərək, müasir həyatın, xalq təsərrüfatının qarşıya qoyduğu məsələlərlə əlaqədar olaraq praktik iş görmək lazımdır.* "Az. məkt.". // Boş, məzmunsuz, təmtəraqlı sözlər.

**CÜMLƏSİ** b a x **cümlətani**. *Tutub cümləsini, çatın qol-qola.* H.K.Sanılı.

**CÜMLƏTANİ** *zərf* [*ər.*] Hamılıqla, hamısı bir yerdə, yekunu. *Cümlətani on beş kişi idi: hamısı əsgər geyimli, dəri papaqlı idi.* Çəmənzəminli. [Həsən:] *Cümlətani eləyir iki manat on dörd şahı üç qəpik.* Ə.Haqverdiyev. [Mazandaranski:] [Lojada] *cümlətani dörd nəfər arvad vardır.* C.Cabbarlı.

**CÜNB** *is.* [*ər.*] *köhn.* Yan, yan tərəf, nəzd. *1879-cu ildə .. Qori şəhərində xristian darülmüəlliminin cünbündə müsəlman şöbəsi açıldı..* F.Köçərli. *Xatırımdadır, qardaşım "mollaxanada" məhəlləmizdə Qasımbəy məscidi cünbündəki üsuli-ətiq məktəbində oxuyurdu.* T.Ş.Simurq.

**CÜNG** *is.* [*fars.*] Şairlərin seçmə əsərləri, yaxud beytlərin əlyazma toplusu. *Fars dilində yazılmış cüng.*

**CÜR** *is.* [bəzən "cürə" şəklində də işlənir] 1. Növ, çeşid, qisim. *Mağazada yüz cür şey var.* ◻ **Hər cür** – hər növ, ürəyin istəyən, ən müxtəlif. [Rəsul] *hər cür yeməkdən araya gətirdi.* "Aşıq Qərib". *Qızın qohum-əqrəbaları hərə bir cürə pay götürüb, qızın cehizində olan nöqsan şeyləri dolduracaqlar.* R.Əfəndiyev.

2. Üsul, qayda, tərz. *Ayrı cür edə bilməzdim.* ◻ **Bir cür** – bir qaydada, bir tərzdə. *Hamı bir cür geyinmişdir.* **Bu cür** – belə, bu qaydada, bu tərzdə. *Bu cür işləmək olmaz. –*

[Əsgər xalasına:] *Belə, deyirəm ki, bu cürə dolanacağın axırı nə olsun?* Ü.Hacıbəyov.

**CÜRBƏCÜR** *sif.* Müxtəlif. *Cürbəcür kitablar almaq. Cürbəcür tamaşalara baxmaq. Cürbəcür şəhərlər gəzmək. – Məmmədbağırın başına cürbəcür planlar gəlirdi. S.Hüseyn. Cürbəcür bioloqlar cinsiyyət və irsiyyət haqqında cild-cild elmi əsərlər yazmışlar.* M.Rzaquluzadə. // Növ-növ, hər növ, hər cür, çeşid-çeşid, dürlü-dürlü. *Cürbəcür xırdavat. Cürbəcür xörəklərdən yemək. – Hər rəngə çalan cürbəcür cücülər otlara mərcan kimi sarılmışdı.* S.S.Axundov. *Gövhər xanım yan otaqdan cürbəcür şirniyyat və mürəbbə gətirib süfrəyə düzdü.* Q.İlkin.

**CÜRBƏCÜRLÜK** *is.* Cürbəcür olma, müxtəliflik, başqa-başqalıq.

**CÜRDƏK** *is.* Gildən, saxsıdan, şüşədən və s. materialdan qayrılan darboğazlı su qabı. [Çoban:] *Çox uzaq getmə, elə oradan mənim cürdəyimi götür, bəri gəl.* Ə.Haqverdiyev. [Cəmil] *..balaca saxsı cürdəyi götürüb su gətirdi. Xanıma soyuq su verdi.* Ə.Vəliyev. *Məişətdə işlədilən müxtəlif formalı səhənglər, nimçələr, kasalar, kiçik cürdəklər, qazanlar öz ornamentlərinin zənginliyi ilə seçilir.* "Elm və həyat".

**CÜRƏ¹** *is.* Bir qurtum içki, su; bir udumda içiləcək maye. [Kişi:] *Bir cürə mənə su ver.* Ə.Haqverdiyev.

**CÜRƏ²** *sif.* Çox balaca, çox kiçik, xırdaca, boy atmamış, sısqa. *Cürə uşaq.*

**CÜRƏ³** *is. zool.* Qızılquş növündən alıcı kiçik quş.

**CÜRƏ-CÜRƏ** b a x **cürbəcür**.

**CÜRƏLƏŞMƏ** "Cürələşmək"dən *f.is.*

**CÜRƏLƏŞMƏK** *f.* Balacalaşmaq, kiçikləşmək, sısqalaşmaq. *Uşaq getdikcə cürələşir.*

**CÜRƏT** *is.* [*ər.*] Cəsarət, igidlik, hünər, ciyərlilik, ürəklilik, qorxmazlıq. [Nüşabə:] *Bir bu gəncdə hünərə, cürətə bax!* A.Şaiq. *Buna daha artıq qüvvə, daha böyük cürət lazım idi.* T.Ş.Simurq. ☐ **Cürət etmək (eləmək)** – cəsarət etmək, qorxmamaq, çəkinməmək (bir şey etdikdə). *Ədə, filan, filan şüdə, sən cürət elədin, mənim arvadımın adını soruşdun?* C.Məmmədquluzadə. [Sultan bəy:] [Əsgər] *gör nə qudurğan gədədir ki, cürət edib qızımı istəyir.* Ü.Hacıbəyov.

**CÜRƏTLƏ** *zərf* Qorxmadan, cəsarətlə, igidcəsinə. *Cürətlə irəli yerimək. Cürətlə soruşmaq.*

**CÜRƏTLƏNDİRMƏ** "Cürətləndirmək"dən *f.is.*

**CÜRƏTLƏNDİRMƏK** *f.* Cəsarətləndirmək, ürəkləndirmək, cəsarətə gətirmək. *Bu adamın çox da bənd olmaması, özünü sakit və soyuqqanlı göstərməsi Zoranı cürətləndirdi.* S.Vəliyev.

**CÜRƏTLƏNMƏ** "Cürətlənmək"dən *f.is.*

**CÜRƏTLƏNMƏK** *f.* Cəsarətlənmək, cürətə gəlmək, cəsarətə gəlmək, ürəklənmək. *Bürcü Sultan bu sözü ondan eşidib, bir az da cürətləndi.* "Koroğlu". *Feyzulla evində bir şey tapılmadığını görüb, cürətləndi və birdən səsləndi.* Ə.Haqverdiyev. *Hamı uşağa tərəf döndü, uşaq cürətlənib hərəkətə gəldi.* Mir Cəlal.

**CÜRƏTLİ** *sif.* Heç şeydən qorxmayan, çəkinməyən; cəsarətli, ürəkli, qoçaq, cəsur, igid. *Cürətli oğlan.* – [Gülbadam] *belə bir cürətli* (z.) *olmağına özü də təəccüb edərdi.* N.Nərimanov. *..Qaraca çobanın cürətli müqaviməti, iki qardaşı ilə birgə hələ ilk həmlədə beş-on atlını vurub yıxmaları basqınçıların qəzəbini artırdı.* M.Rzaquluzadə.

**CÜRƏTLİLİK** *is.* Cəsarətlilik, cəsarət, qorxmazlıq, qoçaqlıq. *Lakin bu qorxmazlığa və cürətliliyə baxmayaraq, Baxış oğlu Həsən çox da şəriət qoyan qanundan çıxmaz və dinin yolunu azmazdı.* B.Talıblı.

**CÜRƏTSİZ** *sif.* və *zərf* Cəsarətsiz, qorxaq, ürəksiz, ağciyər. *Cürətsiz adam. Cürətsiz hərəkət etmək. – Cürət! Odur bizi güldürən hər an; Cürətsiz bir həyat məhv olur, inan!* S.Vurğun.

**CÜRƏTSİZLİK** *is.* Cəsarətsizlik, ürəksizlik, qorxaqlıq. *Yenə də mən həmin səsdə cürətsizlik duyurdum.* S.Rəhimov.

**CÜRLƏMƏ** "Cürləmək"dən *f.is.*

**CÜRLƏMƏK** *f.* Növlərə, çeşidlərə, sortlara ayırmaq.

**CÜRM** *is.* [*ər.*] *klas.* Günah, təqsir, suç, qəbahət. *İki şonqar dalaşanda, bir qarğaya cürm düşər.* (Ata. sözü). [Vəzir:] *Sultan Mahmud Qəznəvi bu gunə cürm üçün müqərrəblərindən birisinin boynunu öz əlilə vurdu.* M.F.Axundzadə. *Bağışla cürmümü, ey*

*şux, kim, həyatımda; Çox etmişəm səni azürdə ahü zarım ilə.* Q.Zakir.

**CÜSSƏ** *is.* [*ər.*] Gövdə, bədən; bədən quruluşu, boy-buxun. *Sədr* [Qərənfilin] *ardınca baxaraq, cüssəsinə uymayan nazik və mehriban bir ifadə ilə .. səsləndi.* İ.Əfəndiyev. *Bahadır ilkiydi Rüstəm kişinin, qamətdə, cüssədə sanki özüydü.* B.Vahabzadə.

**CÜSSƏLİ** *sif.* Boy-buxunlu, gövdəli, cəsamətli, qamətli. *Cüssəli kişi. – Rüstəm kişi atın üstündə çox şad oturmuşdu və olduqca cüssəli* (*z.*) *görünürdü.* M.İbrahimov. *Siz sağa baxdıqca müxtəlif cüssəli, cürbəcür boy-buxunlu kişilər gözünüzün qabağından ötüb keçəcəklər.* Ə.Vəliyev. *Əbdül ağa elə birinci gün Səttarxandan öyrəndi ki, bu cüssəli qonaq* [Namaz] *Səhlan kəndində anadan olmuş, hələ gənc ikən Bakıya neft mədənlərində işləməyə getmişdir.* P.Makulu.

**CÜT**$^1$ *zərf* 1. Bir yerdə işlənən və bir bütövü təşkil edən iki eyni şey. *Bir cüt əlcək. Bir cüt çəkmə.* – [Tələbə:] *Usta Ağabala .. bir imperial və iki cüt başmaq verdi. Başmağın bir cütü ağa üçün, bir cütü külfəti üçündür.* Çəmənzəminli. *Bu sözlərdən sonra Camal əmi səliqə ilə .. üç cüt yun, bir cüt tiftik əlcək, beş cüt yun corab, bir yun başlıq, dörd dənə əl dəsmalı səliqə ilə yeşiyə qabladı.* Ə.Vəliyev.

2. İki dənə, iki baş, qoşa. *Cüt uşaq. Cüt qardaşlar. Cüt qızlar. – Şuma vacibdi çünki beş cüt kəl; Biçinə çin gərəkdi, xırmana vəl.* S.Ə.Şirvani. [Sitarə:] *Axır, zalım cüt balamı öldürdü.* C.Cabbarlı.

3. İki bərabər ədədə bölünə bilən. *Cüt ədəd.*

**CÜT**$^2$ bax **xış**. *Bahar açılan kimi Xudayarbəy zəmilərə cüt göndərib başladı sürdürməyi.* C.Məmmədquluzadə. [Cütçü] .. *ahəstə-ahəstə cütünü sürüb, öz nəğməsini oxudu.* S.S.Axundov.

**cüt-cüt** *zərf* İki-iki, qoşa-qoşa. *Kasıbın pişiyi cüt-cüt doğar.* (Məsəl). [Soltan bəy:] *Hə, bəs elə isə başlayaq, düzülün! Cüt-cüt olub oynayırlar..* Y.Hacıbəyov. *Bu quşlar çox vaxt tək-tək, bəzən də cüt-cüt gəzər .. yalnız düz üstlərinə çıxdıqda havaya qalxarlar.* M.Rzaquluzadə.

**CÜTBAŞ(LI)** bax **ikibaşlı**. *Alay-alay hücum çəkin; O cütbaşlı qartal üstə.* S.Vurğun.

**CÜTBUYNUZ(LU)** bax **qoşabuynuz(lu)**. *Cütbuynuzlu keçi. Cütbuynuzlu öküz.*

**CÜTÇƏYİRDƏK(Lİ)** *sif.* İki çəyirdəyi olan. *Cütçəyirdəkli meyvə.*

**CÜTÇÜ** *is. köhn.* Cüt sürən əkinçi. *Çıxdı günəş, doldu cahan nur ilə; Cütçü sürür tarlada cüt şur ilə.* M.Ə.Sabir. *Kəndin yaxınlığındakı çaylaqlarda çəltik üçün yer əkən cütçülərin holavar səsi yüksəlirdi.* Ə.Abasov.

**CÜTDIRNAQ(LI)** bax **qoşadırnaqlı**.

**CÜTDIRNAQLILAR** bax **qoşadırnaqlılar**.

**CÜTQANAD(LI)** bax **qoşaqanadlı**.

**CÜTLƏLƏKLİ** *sif.* Cüt ləléyi olan, qoşaləlékli. *Cütləlékli bitkilər.*

**CÜTLƏMƏ** "Cütləmək"dən *f.is.*

**CÜTLƏMƏK** *f.* Eyni qəbildən olan iki şeyi bir-birinin yanına qoymaq, cüt eləmək, cüt qoymaq, qoşalamaq. [Koroğlu:] *Barmaqlarını cütləyib tellərə elə vurdu ki, meydan səsə gəldi.* "Koroğlu". [Şirzad] *ayaqlarını cütləyərək xalçanın üstündə süzür..* M.İbrahimov. [Əlyarov:] *Hə, indi su tök görüm, – dedi və əllərini cütləyib aftafanın qabağına tutdu.* M.Hüseyn. // İki-iki götürmək, ikiləmək, cüt-cüt ayırmaq. *Güləngiz ipək açmağı mükəmməl bildiyi kimi, ipək telləri cütləməyi və burmağı da yaxşı bilir.* (Qəzetlərdən).

◊ **Başmaqlarını (qabağına) cütləmək** – bax **başmaq**. *O oldu ki, Həsənovun başmaqlarını cütlədilər qabağına.* Mir Cəlal.

**CÜTLƏŞDİRİLMƏ** "Cütləşdirilmək"dən *f.is.*

**CÜTLƏŞDİRİLMƏK** *məch.* Cüt edilmək, ikiləşdirilmək, qoşalaşdırılmaq.

**CÜTLƏŞDİRMƏ** "Cütləşdirmək"dən *f.is.*

**CÜTLƏŞDİRMƏK** *f.* 1. Cüt etmək, ikiləşdirmək, qoşalaşdırmaq. *Çoxları bu payızda oğlunun toyunu eləmək, qızına cehiz almaq, inəyini cütləşdirmək həsrətilə yaşayırdı.* M.İbrahimov. // Bax **cütləmək**. *Ayaqlarını cütləşdirmək.*

2. *k.t.* Döl almaq üçün erkək və dişi heyvanları bir-birilə görüşdürmək.

**CÜTLƏŞMƏ** "Cütləşmək"dən *f.is.*

**CÜTLƏŞMƏK** *f.* 1. Cüt olmaq, ikiləşmək, qoşalaşmaq. // Bir-birinə yanaşı olmaq,

birbirinin yanında durmaq. *Qızlar cütləşib oyuna girdilər.*

2. *k.t.* Cinsi əlaqədə olmaq (heyvanlar haqqında).

**CÜTLƏYİCİ** *is. xüs.* Bir şeyi cütləyən, cüt-cüt bağlayan, yaxud cüt-cüt ayıran işçi. *Güləngiz təkcə ipəkaçanların yox, yeri gələndə burucuların və cütləyicilərin də köməyinə çatır.* (Qəzetlərdən).

**CÜTLÜK**[1] *is.* Cüt olma; ikilik, qoşalıq; cüt şeyin halı.

**CÜTLÜK**[2] *is.* Cüt sürülən yer. [Nərgiz] *ata-anasından izin alıb, kəndin qırağındakı cütlüyə bənövşə yığmağa .. getdi.* "Məktəb".

**CÜTLÜKDƏ** *zərf* İkisi bir yerdə, üçüncünün iştirakı olmadan.

**CÜTTOXUMLULAR** b a x **ikiləpəlilər**.

**CÜVƏLLAĞI** *sif.* Kələkbaz, fırıldaqçı, qeyri-ciddi. [Xəlil:] [Rövşən] *hərçənd bir az cüvəllağı idi, amma yaxşı oğlanların biri idi.* S.Rəhman. // İs. mənasında. [Xan:] *Sizin heç biriniz mənim mərhəmətimə layiq deyil! Bu cüvəllağını niyə qoydunuz, getdi?* M.F.Axundzadə. [İkinci kəndli:] *Deyəsən, cüvəllağılar Həsənin evini yandırdılar.* Ə.Haqverdiyev. ..[Həsən:] [Zəhra] *birdən keçər bir cüvəllağının əlinə, yıxar evimi, papağımı vurar yerə.* M.İbrahimov.

**CÜVƏLLAĞILIQ** *is.* Kələkbazlıq, fırıldaqçılıq. *Evimizə gedəndə anama Əhmədin cüvəllağılığını başladım nəql eləməgə.* C.Məmmədquluzadə.

**CÜYÜLDƏMƏ** "Cüyüldəmək"dən *f.is.*

**CÜYÜLDƏMƏK** *f.* Cikkildəmək, ciyildəmək. *Fərli cücə yumurtada cüyüldər.* (Ata. sözü).

**CÜYÜLTÜ** *is.* Cikkilti, ciyilti, cük-cük. *Quş balalarının cüyültüsü.*

**CÜYÜR** *is. zool.* Marallar fəsiləsindən ceyranabənzər cütdırnaqlı, kövşəyən heyvan; əlik. *Sıra dağlar, gen dərələr; Ürək açan mənzərələr; Ceyran qaçar, cüyür mələr..* S.Vurğun. *Cüyürlərin cığırını axtarmışam qayalarda; "Oxqay!" deyib oturanda "oxqay!" deyib qayalar da.* R.Rza. *Çal təpələr, boz dağlar da xeyli uzaqdı; Nə mələyən cüyür vardı, nə qoyun, quzu..* Ə.Cəmil.

**CÜZ** *is.* [*ər.*] Küll halında olan bir şeyin hissələrindən biri; hissə, qisim, parça. // *din.* Quranın bölündüyü otuz hissədən biri. [Durna:] *Qoy 30 cüz Quran mənim ciyərimi parça-parça doğrasın!* C.Cabbarlı. *Xəlfə dib tərəfdə, köhnə palaz üstündə oturub, ölgün çıraq işığında cüz oxuyurdu.* M.Hüseyn.

**CÜZAM** *is.* [*ər.*] *tib.* Əsasən dəri və toxumaların çürüməsi şəklində təzahür edən ağır xronik xəstəlik, lepra.

**CÜZAMLI** *sif.* Cüzam xəstəliyinə tutulmuş. *Bunların biri cüzamlı Abbas idi, qalanının qaranlıqda kim olduqları məlum deyil idi...* Çəmənzəminli.

**CÜZİ** *zərf* [*ər.*] 1. Az, azacıq, kiçik. Cüzi məbləğ. *– Belədirsə, həmişəlik yetimlər üçün bir məktəb açın, aldığınız prosentlərin cüzi bir hissəsini bu xeyir işə vəqf ediniz.* N.Nərimanov. *Kərim baba naxırı saxladığı, otardığı üçün aldığı cüzi aylıq ilə keçinərdi.* A.Şaiq.

2. Əhəmiyyətsiz, xırda, boş. [Ağa Mərdan bəy] *gah cüzi bir şeyin üstündə Reyhan xanımı döyər, gah məst olaraq arvadı evdən çıxarıb mətbəxdə, balkonda yatmağa məcbur edərdi.* T.Ş.Simurq.

**CÜZİLİK** *is.* Kiçiklik, xırdalıq, əhəmiyyətsizlik; azlıq.

**CÜZVİ** b a x **cüzi**. [Ağa Kərim:] *Mən bir cüzvi işdən ötrü onunla küsülüyəm.* M.F.Axundzadə. *Bəli, biz burada Mozalan kəndinin xəstəliyi olan sümük azarından – yəni xəbərçilikdən hamısını yox, əsla küllisini yox, cüzvisini yazmaq istərdik.* S.Rəhimov.

# Çç

**Ç** Azərbaycan əlifbasının dördüncü hərfi. B a x **çe**.

**ÇADIR** *is.* Su buraxmayan parçadan düzəldilən müvəqqəti yaşama, daldalanma yeri. *Çadır qurmaq. Brezent çadır. – Feldşer çadıra gələndə yaralı yenə də dişlərini qıcıldadır, ufuldayırdı.* M.Hüseyn. *Midhəd çadırdan çıxdıqdan sonra komandir dərin fikrə getmişdi.* Ə.Vəliyev.

**ÇADIRÇI** *is. köhn*. Çadır ustası. [Çadırçı usta:] *Bizə yoldaşdı o rəhmətlik baban; Bir çadırçıydı o da*. H.Cavid.

**ÇADRA** *is.* Qadınların başdan topuğacan bədənlərini örtmək üçün işlətdikləri büründək; çarşab. *Çadra örtmək.* – [Cahan:] *..Qoy elə bu güncə çadramı başıma salıb gedim,* [Əsgər] *üçün qız bəyənib seçim.* Ü.Hacıbəyov. *Külək vurduqca Tellinin qıyqacı örtdüyü çadrasını yelləndirirdi.* S.Hüseyn.

**ÇADRALI** *sif.* Çadra örtmüş, başında çadra olan; çarşablı. *Çadralı qadın. – Öncə gələn atın üstündə ağır gövdəli, ağ çadralı bir xanım oturmuşdu.* Çəmənzəminli. [Murad] *bir gün küçə ilə keçərkən qarşısına çadralı bir qız çıxdı.* S.Hüseyn.

**ÇADRASIZ** *sif.* Çadra örtməmiş, başında çadra olmayan; çarşabsız, üzüaçıq. *Çadrasız arvad.*

**ÇAĞ**[1] *is.* Vaxt, zaman. *Bu çağacan harada qalmısan? Nə çağacan səni gözləyək? – Günbatan çağı Kürün üstünü bürüyən duman ətəyini sallayaraq, asta-asta ətrafa yayıldı.* İ.Şıxlı.

◊ **Oğlan çağı (çağında)** – bir şeyin ən qızğın, ən gərgin dövrü(ndə). *Qışın oğlan çağında .. Nəriman .. hissələrinə yola düşdü.* Mir Cəlal. *..Bu günlər dördüncü iqlim ölkəsi Azərbaycanda yayın oğlan çağı idi.* Ə.Məmmədxanlı.

**ÇAĞ**[2] *sif.* 1. Sağlam, saz, hələ əldən düşməmiş. *Çox da qocalmışam, hələ ki, çağam; Bir az namus, qeyrət, ar sinəmdə var.* Aşıq Ələsgər. □ **Çağ olmaq** – sağlam olmaq, saz olmaq. *Nələrə dözməmisən, sağ ol, mənim ürəyim! Həmişə olduğun tək çağ ol, mənim ürəyim!* S.Rüstəm.

2. Kefi kök, dərdsiz, qəmsiz. *Uşağın kefi çağdır. // dan*. Kök, dolğun, tosqun. *Çağ qız. Çağ uşaq.*

**ÇAĞA** *is. dan.* Körpə uşaq. *Aygün alıb çağasını bağrına basır; Analara təsəllidir dar gündə övlad.* S.Vurğun. *Bu anda çağa qışqırdı, onun həyat qədər güclü və sağlam səsi atasının sözlərini təsdiq edirdi.* M.Hüseyn.

**ÇAĞALIQ** *is.* Uşaqlıq, körpəlik. *Çağalıq dövrü.*

**ÇAĞILTI** *is.* Çağlayan suyun çıxardığı səs, axan suyun daşlara, qayalara çarparaq çıxardığı səs. *Güclənən sellər dərəaşağı çağlayırdı. Elə bil bu çağıltı öz ahəngi ilə "gəl-gəl" deyə Qəhrəmanı çağırırdı.* S.Rəhimov.

**ÇAĞIRICI** *sif.* Çağıran. [Qadının] *amiranə çağırıcı ahəngi mübarizə və qələbə ruhu ilə doludur.* R.Rza.

**ÇAĞIRILMA** "Çağırılmaq"dan *f.is.*

**ÇAĞIRILMAQ** "Çağırmaq"dan *məch. İclas çağırılmışdı. İclasda bircə məsələ müzakirə edilirdi.* M.S.Ordubadi. *Bəndalı təqsirini etiraf etmədiyi üçün təzə şahidlər çağırılmışdı.* Mir Cəlal.

◊ **Çağırılmamış qonaq** – dəvətsiz olaraq bir yerə gəlmiş, yaxud arzu olunmadığı və ya gözlənilmədiyi halda gəlmiş adam haqqında. *Çağırılmamış qonağın gəlməsi* [Məstan bəyi] *pərt etdi.* B.Talıblı. *Atlıxanla Güləndam özlərini bikef göstərsələr də sevinirdilər ki, binənin suyunu bulandıran bu çağırılmamış qonaq axırı ki, çıxıb gedir.* İ.Məlikzadə. **Çağırılmış bayatı** – çoxdan deyilmiş, çoxdan məlum olan, artıq əhəmiyyəti, mənası olmayan sözlər haqqında.

**ÇAĞIRIM** *is.* Səs gedib çatan məsafə. *İki çağırım qədər getmişdik ki, uzaqda biçinçilərin oraqlarının qat-qarışıq səsləri qulağımıza yetişdi.* A.Şaiq. [Qaraca Çoban] *hər çağırımda növbətçi qoymalarını, hər ehtimala qarşı hazır və sayıq olmalarını, işarə verilən kimi düz bura yığılmalarını* [atlılarına] *tapşırdı.* M.Rzaquluzadə.

**ÇAĞIRIŞ** *is.* 1. Çağırma, səsləmə; çağırma səsi. [Qəhrəman] *dayanıb bu çağırış səsini dinləyirdi.* S.Rəhimov. *Şahpəri altdan-üstdən geyinib Daşdəmirin çağırışına getdi.* B.Bayramov.

2. Bir rəhbər ideyanı, siyasi tələbi qısa şəkildə ifadə edən müraciət; şüar. [Nizami:]

*..Qızıl Arslanın çağırışına birinci növbədə mən səs verirəm.* M.S.Ordubadi.

3. Bir iş görmək, vəzifəsini yerinə yetirmək üçün tələb və ya xahişlə bir yerə gəlmə. [Həsən ağanın] *oğlu anasının çağırışını dərhal başa düşdü və yapıncılı-çuxalı eyvana çıxdı.* İ.Şıxlı.

4. Bax **çağırış vərəqəsi**. *Ağabala hələ indiyə qədər çağırış almamışdı.* Mir Cəlal.
☐ **Çağırış vərəqəsi** – bir yerə çağırılmaq haqqında qısa yazılı məlumat, çağırış. *Məhkəmədən çağırış vərəqəsi almaq. – Birdən Gəray çağırış vərəqəsini masanın üstə qoyub dilləndi.* Ə.Əbülhəsən.

**ÇAĞIRIŞÇI** *is.* Hərbi xidmətə çağırılan adam (gənc). *Bakıda Firidunu növbəti çağırışçılara qoşub, Tbilisiyə göndərdilər.* Mir Cəlal.

**ÇAĞIRIŞMA** "Çağırışmaq"dan *f.is.*

**ÇAĞIRIŞMAQ** *qarş.* Bir-birini çağırmaq, səs-səsə verərək çağırmaq. *Durna yoldaşları ilə meşə meyvələrindən yığır, kənd qızları bir-birini itələyir, zarafatlaşır, çağırışırdılar.* Ə.Vəliyev.

**ÇAĞIRMA** "Çağırmaq"dan *f.is.*

**ÇAĞIRMAQ** *f.* 1. Birinin adını, yaxud təxəllüsünü, ləqəbini ucadan deyərək yanına gəlməsini, yaxınlaşmasını, ya da cavab verməsini istəmək. *Birdən: – Ərbab! – deyə, birinin arxamdan alçaq səslə məni çağırdığını eşitdim.* S.Hüseyn. *Mahirə .. durna boğazını yuxarı tutaraq çağırırdı: – Sarxan, Sarxan!* M.Hüseyn.

2. Bir yerə dəvət etmək. *Toya çağırmaq. – Ana Südabəyə yavaşca: – Qızım, Firidunu qonaq çağırsana, – dedi.* M.İbrahimov. *Qış tətilinə gələn bacısı qızı Zərifəni Qafar bu gün qonaq çağırmışdı.* Ə.Əbülhəsən.

3. Mühüm bir işi görməyə dəvət etmək, cəlb etmək, ruhlandırmaq. *Vətəni müdafiəyə çağırmaq. Düz yola çağırmaq. – Mənim də köksümdə bu səs bağırır; Hünərə, əməyə, işə çağırır.* A.Şaiq. *İlk söhbəti, ilk sözü yol açdı ürəklərə; Çağırıb insanları nurlu, aydın səhərə.* R.Rza.

4. Adətən hərəkət bildirən bəzi isimlərlə birlikdə təklif etmək, tələb etmək mənasında tərkiblər əmələ gətirir. *Sükuta çağırmaq. Sayıq olmağa çağırmaq. Tabe olmağa çağırmaq. Nizama çağırmaq.*

5. İclas, müşavirə, kollegial orqan və s. üzvlərini məsələ həll etmək, məsləhətləşmək, bir qərar çıxarmaq üçün bir yerə yığmaq. *İclas çağırmaq. – Müalicə komissiyasından qayıdan kimi Zahir büro çağırıb katibliyi müvəqqəti Gəldiyevə həvalə etmişdi.* Mir Cəlal.

6. Çağırış vərəqəsi ilə birinin bir yerə gəlməsini xahiş və ya tələb etmək. *Hərbi komissarlığa çağırmaq. – ..İndi Güldəstəni başqa bir milis şöbəsinə çağırmaq lazım gələcək.* H.Seyidbəyli.

7. *məc.* Hava ilə oxumaq. *Bayatı çağırmaq. – Aşıq gördüyünü çağırar.* (Ata. sözü). [Əbdürrəhman bəy:] *Əlinin ikisini də qoy qulaqlarının dibinə, gəraylı çağır.* N.Vəzirov. [Balaqız:] *Səfi oğlu İskəndər gecələr səhərədək sizin doqqazda bayatı çağırır.* Ə.Haqverdiyev.

8. *məc.* Arzu etmək, istəmək, həvəsində olmaq. *İftara bir az qalanda mömin müsəlmanlar təsbeh çevirə-çevirə dodaqları duanı vird eləyəndə ürəkləri də plov çağırır.* C.Məmmədquluzadə.

**ÇAĞIRTI** *is.* Çağırış, çağırış səsi.

**ÇAĞIRTMA** "Çağırtmaq"dan *f.is.*

**ÇAĞIRTMAQ** *icb.* Başqası vasitəsilə çağırmaq. *Üç gün sonra Mehribanın atası Ağdaşdan gəlmişdi. Onu teleqrafla Mehriban çağırtmışdı.* S.Hüseyn. *Verdiyev adam göndərib, layihə bürosundan "vacib iş üçün" Gəldiyevi çağırtdı.* Mir Cəlal.

**ÇAĞLAMA** "Çağlamaq"dan *f.is.*

**ÇAĞLAMAQ** *f.* 1. Çağıltı ilə axmaq, şırıltı ilə köpüklənərək tökülmək. *Şəlalə çağlayır. – Göy otların arasından bulaqlar; Şırıltıyla köpüklənərkən çağlar.* A.Səhhət. *Nəbi .. qıjıltı ilə gedən çaylara, qayalardan çağlayıb tökülən şəlalələrə tamaşa edirdi.* S.Rəhimov.

2. *məc.* Qaynamaq, coşmaq. *Cəmisi bir ay əvvəl burada sakit və məsud bir həyat çağlayırdı.* Mir Cəlal. *O getdi, çağladı ürəyində kin; Getdi sorağında baharın, yazın.* N.Xəzri. // Obrazlı təşbehlərdə. *Könül hıçqırtısı, qəlb atəşi, can yanğısıdır; Sən mənim göz yaşım ol, çağla, Segah, çağla, Segah!* B.Vahabzadə.

**ÇAĞLAYAN** *is.* Şəlalə, şırran.

**ÇAHARŞƏNBƏ** [*fars.*] b a x **çərşənbə**.

**ÇAXÇAX** *is.* 1. Keçmişdə: qapını döymək üçün ona vurulan dəmir toxmaqdan ibarət alət. *Məşədi Kazım yenicə oturmuşdu, qapının çaxçaxı vuruldu..* M.S.Ordubadi.

2. Çəpər kimi yan-yana vurulan ensiz taxtalardan hasar; məhəccər.

**ÇAXÇUR** *is.* Keçmişdə: qadınların geydikləri balağı büzməli enli şalvar növü. *Qadınlar rübənd vurmağa, çaxçur geyməyə macal tapmayıb hara gəldi qaçırdılar.* P.Makulu.

**ÇAXICI** *is.* Çaxma (2-ci mənada) ustası.

**ÇAXIR** *is.* Şərab. *Calal başını kənara çəkib üzünü turşudur: – Vallah, dadaş, genə çaxır içmisən.* C.Məmmədquluzadə.

◊ **Çaxır tuluğu** *zar.* – içki düşkünü.

**ÇAXIRÇI** *is.* Çaxır (və b. içkilər) satılan dükan. *Əvəzində buların çayçı, çaxırçı dükanı; Gecə-gündüz doludur cümlə müsəlman, mənə nə?* M.Ə.Sabir. // *köhn.* Çaxır dükanının sahibi. *Mübahisə başlanardı, çaxırçı fit verərdi və yalandan qorodovoy gələrdi.* H.Sarabski. // Çaxır hazırlayan adam.

**ÇAXIRÇILIQ** *is.* Şərabçılıq.

**ÇAXIRSATAN** *is.* Çaxır (və s. içkilər) satmaqla məşğul olan adam.

**ÇAXIŞ** *is.* Çaxmaq işi, çaxma. *O, göylərin şimşəyi; Yerlərin üsyanıdır; İldırım çaxışıdır.* B.Vahabzadə.

**ÇAXMA** 1. "Çaxmaq$^2$"dan *f.is.*

2. *xüs.* Müxtəlif metal lövhələri vurub qabartmaqla hazırlanan naxışlı bəzək əşyası; çekanka.

**ÇAXMAQ$^1$** *is.* 1. Odlu silahlarda zərb mexanizminin hissəsi; yay. *Tapançanın çaxmağı. – Bütün ümidlərinin alt-üst olduğunu görən Vəli tüfənginin çaxmağını çəkdi.* M.Hüseyn. *Nişançılar isə .. silahlarını, xüsusən çaxmaqlarını təmizləyirlər..* Ə.Əbülhəsən.

2. Keçmişdə: çaxmaqdaşına vurub qığılcım çıxararaq qovu yandıran çox bərk daş, yaxud dəmir (polad) parçası. *Qasım kişi çaxmağı daşa vurub qovu basır çubuğa.* C.Məmmədquluzadə. [Hüseynəli əmi] *..dəri kisənin içərisindən çaxmağı və daşı götürüb qovu odladı..* M.S.Ordubadi. // Keçmişdə: od almaq üçün işlədilən çaxmaq, çaxmaqdaşı və qov bir yerdə. *Çaxmaqla papirosu yandırmaq.*

**ÇAXMAQ$^2$** *f.* 1. Atəş açmaq üçün tüfəngin, tapançanın çaxmağını çəkib buraxmaq; atəş açmaq; güllə ilə vurmaq. *Səttar daxılı çəkir, tapançanı çıxarıb Kəblə Heybətin kürəyinə bir güllə çaxır.* H.Sarabski. *Həmin saat tüfəngin iki gözünü də çaxdım, ancaq heç biri dəymədi.* M.Rzaquluzadə.

2. Birdən-birə işıldamaq, parıldayıb bərk şaqqıldamaq (ildırım, şimşək haqqında). *Şimşək çaxdı. – Faytonun içərisini sükut bürümüşdü, bayırda isə şiddətlə yağış yağır, göy guruldayır və ildırım çaxırdı.* M.S.Ordubadi. *Gün çıxar, qar yağar, ildırım çaxar; Əgər tənha olsa, dağ da darıxar.* N.Xəzri. // Obrazlı təşbehlərdə işlədilir. *Kinli ürəklərdə bəslənən şimşək; Başında partladı, gözündə çaxdı.* M.Müşfiq. *Dəmirqayanın gözləri alovlanır, baxışlarından ildırımlar çaxırdı.* H.Nəzərli. // Vurmaq, ilişdirmək. *Başına bir yumruq çaxdı.* // Əllə və ya əldə tutulan bir şeylə vurmaq; qaxmaq. *Mıx çaxmaq.*

**ÇAXMAQDAŞI** *is.* Keçmişdə: od almaq (qığılcım çıxarmaq) üçün çaxmağın vurulduğu xüsusi daş parçası. [Baba] *qovu çaxmaqdaşı ilə alışdırıb çubuğu yandırdı.* Çəmənzəminli. [Qızıl qayada] *yer altından çıxan qaz, kim bilir, nə zamansa bir yolçunun, bir ovçunun, ya bir çobanın çaxmaqdaşından od alıb, gecə-gündüz şölə çəkib yanır.* R.Rza.

**ÇAXMAQ-QOV** *top.* Keçmişdə: od almaq (qığılcım çıxarmaq) üçün işlədilən çaxmaq və qov. [Nəbi] *sonra qəlyanını doldurub, çaxmaq-qovla yandırdı.* Ə.Abasov.

**ÇAXMAQLI** *sif.* Çaxmağı olan. □ **Çaxmaqlı tüfəng (tapança)** – keçmişdə: çaxmaqdaşı və çaxmaq vasitəsilə alışdırılan primitiv tüfəng (tapança). *Otaqların bütün əşyası çaxmaqlı tüfəng və köhnə xəncərdən ibarət idi.* A.Şaiq. [Güləli] *..ala iti kəmsiyindən açıb yanına aldı, ulu babasından qalan çaxmaqlı tüfəngi də çiyninə saldı.* S.Rəhimov.

**ÇAXNAŞDIRMA** "Çaxnaşdırmaq"dan *f.is.*

**ÇAXNAŞDIRMAQ** *f.* Aranı qarışdırmaq, qarışıqlıq salmaq, bir-birinə vurdurmaq, çaxnaşma (çaxnaşıq) salmaq. [Balarza:] *Xub, bəs bunu hansı haramzada eləyir, kəndi çaxnaşdırır bir-birinə?* C.Cabbarlı.

**ÇAXNAŞIQ** b a x **çaxnaşma** 2-ci mənada. □ **Çaxnaşıq düşmək** – b a x **çaxnaşma**

**düşmək** (*“***çaxnaşma***”*da). [Çopo:] *Sabaha qədər davam edən qanlı vuruşmadan sonra xaqan ordusuna çaxnaşıq düşdü..* Çəmənzəminli. **Çaxnaşıq salmaq** – b a x **çaxnaşma salmaq** (*“***çaxnaşma***”*da). [Kor:] *İskitlər hücum edəcəkləri xalqlar arasına çaxnaşıq salmaq üçün hücumdan əvvəl oraya korları göndərərlər.* Çəmənzəminli. // *sif.* Həyəcanlı, vahiməli. *Car çəkir çarxların çaxnaşıq səsi; Car çəkir, qışqırır nəhəng motorlar.* S.Vurğun.

**ÇAXNAŞMA** 1. “Çaxnaşmaq”dan *f.is.*

2. Qarışıqlıq, həyəcan, təlaş, vahimə, vəlvələ. *Camaat içərisində bərk çaxnaşma oldu.* “Abbas və Gülgəz”. □ **Çaxnaşma düşmək** – həyəcanla dolu qarışıqlıq düşmək, vəlvələ düşmək, vahimə düşmək, hamı bir-birinə dəymək, çaxnaşmaq. *Karvan əhli bir-birinə dəydi. Bir çaxnaşma düşdü, gəl görəsən.* “Koroğlu”. *Qoşunu görən kəndlilər qaçır, ətrafa çaxnaşma düşürdü.* Çəmənzəminli. **Çaxnaşma salmaq** – həyəcan salmaq, vəlvələ salmaq, vahimə salmaq, qarışıqlıq salmaq, aranı qarışdırmaq, çaxnaşdırmaq. *Qıssanın səsi həyatin sükutunu pozdu, ümumi bir çaxnaşma saldı.* Mir Cəlal.

**ÇAXNAŞMAQ** *f.* Asayiş, əmin-amanlıq pozulmaq, hamı bir-birinə dəymək, qarışıqlıq düşmək, çaxnaşma düşmək. *Talan oldu elin varı; Aralıq çaxnaşdı yenə.* S.Vurğun. *Camaat çaxnaşdı, qasırğalı dəniz kimi irəli hücum çəkdi.* Ə.Vəliyev.

**ÇAQ-ÇAQ** *is.* Keçmişdə: evlərin həyət qapısında qapını döymək üçün dəmir toxmaqcıq. *Çaq-çaqla qapını döymək. – Qapının başında şir şəkli, sol tayında sarı bürüncdən çaq-çağın ucu ilan başına bənzəyir.* M.S.Ordubadi.

**ÇAQ-ÇUQ** *təql.* Çaqqaçaq, çaqqıltı, çaqçaq səsi. *Xozeyin dinməz-söyləməz çötkəni götürüb, çaq-çuq hesab elədi.* S.M.Qənizadə.

◊ **Çaq-çuq eləmək** *dan.* – xırda alver və ya xırda bir işlə məşğul olmaq. [Məşədi Məmməd:] *Köhnə paltar alıb-satıram.* [Səməd:] *Hə, belə de! Bir az çaq-çuq edirik.* B.Talıblı. [Yəhya Kamal:] *Niyə qoymursan çaq-çuğumuzu eləyək?* Mir Cəlal.

**ÇAQIL** *is.* Çınqıl, çaydaşı. *Toplandı bir yerə çaqıl, kirəc, su.* M.Müşfiq.

**ÇAQQAÇAQ, ÇAQQAÇUQ** *təql.* Çaq-çaq səsi; çaqqıltı. [Əsgərlər] *..söhbət edərək, aldıqları patronları çantalarına qoyur, daraqların silaha düşüb-düşmədiyini çaqqaçaqla yoxlayırdı*(*lar*). Ə.Əbülhəsən.

**ÇAQQAL** *is.* [*fars.*] *zool.* Əsasən cəmdəklə qidalanan itkimilər ailəsindən vəhşi heyvan. *Çaqqal var gödən çıxarır, qurdun adı bədnamdır.* (Ata. sözü). [Ömər koxa] *..qapıbacalarda ləngiyən mal-qaranın mələşməsinə qulaq asar, Kürün bəri üzündəki tülkülərin, çaqqalların vaqqıltısını dinləyərdi.* İ.Şıxlı.

◊ **Çaqqal yağışı** – günəşli havada yağan irigilə yağış.

**ÇAQQALBOĞAN** *is.* Hər cür kal, bərk, boğucu meyvə haqqında.

**ÇAQQILDAMA** “Çaqqıldamaq”dan *f.is.*

**ÇAQQILDAMAQ** *f.* Çaqqıltı səsi çıxarmaq.

**ÇAQQILTI** b a x **çaqqaçaq**.

**ÇAL** *sif.* 1. Başqa rənglə qarışıq boz rəng; açıq-boz və ya tünd-boz. *Çal ayğır qulağını qırpıb adamların üstünə cumanda handa bir özündən deyən igid belə qabağında dura bilmir..* Ə.Vəliyev. *Başında çal papaq, çiynində xurcun; İldırım çaxırdı gözündən onun.* B.Vahabzadə.

2. Ağarmağa başlamış, dən düşmüş. *Qoca çal qaşları altında gizlənmiş gözlərini yarı qapayaraq şagirdinə qulaq asdı..* Ə.Məmmədxanlı. *Ləzzətli düşbərəni iştaha ilə yeməyə başlayan usta çal bığlarını sığalladı.* B.Bayramov. □ **Çal düşmək** – ağarmağa başlamaq, dən düşmək.

3. Bitkisi az olan və ya heç olmayan; boz. *Meşənin arasında çal qayalığın ayağı iki yana ayrılmışdı.* S.Rəhimov. *Çal təpələr, boz dağlar da xeyli uzaqdı; Nə mələyən cüyür vardı, nə qoyun-quzu..* Ə.Cəmil.

**ÇALA** *is.* Çökək yer, çuxur yer, çökəklik. [Səməd:] *Baxın, o çalada .. pambıq adam boyundan yuxarıdır.* T.Ş.Simurq. *Orxan o tərəfə adladı və gördü ki, .. it balaca çaladakı ayranı uzun, qırmızı dili ilə laqqıldadalaqqıldada içir.* İ.Məlikzadə.

**ÇALACIQ** “Çala”dan *kiç.*: kiçik çala. *Cərgələrdə bir-birindən 25 sm aralı olaraq çalacıqlar* (*yuvacıqlar*) *qazılmalıdır.* “Çay bitkisi”.

**ÇALA-ÇÖKƏK, ÇALA-ÇUXUR** *is.* Hamar olmayan, çala-çuxur çox olan yer, oyuq-oyuq yer. *Çala-çuxuru hamarlamaq. – Çala-çuxur əlindən maşınlara gün yox idi.* Ə.Əbülhəsən. *Arabada oturan iki nəfər .. arabanın çala-çuxura düşüb silkələnməsinə əhəmiyyət vermirdi..* H.Seyidbəyli. // Sif. mənasında. *Çala-çuxur sahə. Çala-çökək yerlər. – Faytonumuz çala-çuxur yollarla gedirdi.* M.S.Ordubadi.

**ÇALA-ÇUXURLUQ** *is.* Çala-çuxur olan yer. // Çala-çuxur yerin halı.

**ÇALAĞAN** *is. zool.* Uzun qanadları və əyri dimdiyi olan iri yırtıcı quş. *Ovlayıb öz şikarını uçaraq; Qonur, orda didib yeyir çalağan.* A.Səhhət. *Havada süzən iri bir çalağanın kölgəsi çəpərin üstündən aşıb, həyətin ortası ilə tövləyə doğru süründü.* İ.Şıxlı.

**ÇALALAMA** "Çalalamaq"dan *f.is.*

**ÇALALAMAQ** *f.* Çala qazımaq, çuxurlamaq, qazıb çala halına gətirmək. [Bir dəstə adam] *boz torpağı tərpədib, yeri çalalayıb eşdilər.* S.Rəhimov.

**ÇALALANMA** "Çalalanmaq"dan *f.is.*

**ÇALALANMAQ** *f.* Oyulmaq, oyuq əmələ gəlmək, çala əmələ gəlmək. *Damcı-damcı tökülən su göy daşın üstünə damcılayanda daş çalalanır, damcı, getdikcə daşı əridir və özünə yer düzəldir.* S.Rəhimov.

**ÇALAN(ÇI)** b a x **çalğıçı**.

**ÇALAR(LIQ)** *is.* 1. Əsas rəngdən yalnız tonla fərqlənən rəng müxtəlifliyi. *Rəng çaları.* 2. *məc.* Bir şeydəki kiçik müxtəliflik, azacıq fərq; incəlik. *Sözün məna çalarları.*

**çalar...** Bir sıra rəng adlarına qoşularaq oxşarlıq, bənzərlik, yaxınlıq bildirir; məs.: ağaçalar, qırmızıyaçalar və s.

**ÇALBAŞ(LI)** *sif.* Başı çal, başı (saçları) çallaşmış, başına (saçlarına) dən düşmüş. *Çalbaş qadın.*

**ÇALBIĞ(LI)** *sif.* Bığları çal, bığı çallaşmış, bığına dən düşmüş. *Çalbığlı qoca. – Çalbığ baytar müsafirləri əyləndirmək üçün sükutu pozdu..* Çəmənzəminli.

**ÇAL-BOZ** *sif.* Bozaçalan, çal rəngli; həm çal, həm də boz rəngdə olan. *Çal-boz qaya.*

**ÇAL-ÇAĞIR** *is.* Musiqi ilə birgə oxuma; çalğı və nəğmə səsi; şənlik. *Yaz fəslinin mayından başlamış payızın qırovuna qədər alaçıqla örtülən bu yerlər şənliklə, çal-çağırla dolur..* S.Rəhimov. *Görəsən nə olub, nə əhvalat baş verib ki, qırx ildən sonra, yazın çal-çağır vədəsində Mirzənin güzarı bu yerlərə düşüb?* İ.Məlikzadə.

**ÇAL-ÇAP** *is.* Çalıb-çapma; soyğunçuluq, çapovul(çuluq). *Qovğasız durmaqdan bezmişdilər lap; Yox idi atışma, nə başqa çal-çap.* H.K.Sanılı. *Dəyələrdə də həmişə çal-çap olurdu.* Mir Cəlal.

**ÇAL-ÇARPAZ** *zərf* Çarpaz, çarpaz şəkildə. *Qatarı döşündə, beldə çal-çarpaz; Tüfəng-tapançalar edilmişdi saz.* H.K.Sanılı. [Qadın] *başına örtdüyü, boğazına doladığı ağ yun şalın uclarını belinə çal-çarpaz bağlamışdı.* Mir Cəlal.

**ÇAL-ÇƏPƏR** b a x **çəpər** 1-ci mənada. *Çal-çəpər sökülüb dağılmışdı.* B.Bayramov. *Çal-çəpəri çoxdan dağılmış, ağaclarının çoxusu qurumuş bağçada .. ağ süfrə salınmışdı.* İ.Hüseynov.

**ÇALDIRMA** "Çaldırmaq"dan *f is.*

**ÇALDIRMAQ** *icb.* Çalmaq[1] (1-ci mənada) işi gördürmək, çalmağa məcbur etmək. [Çimnaz:] *Qıza nəsihət verməkdənsə, çalğıçı gətirib çaldırmaq daha yaxşı olmazdımı?* Ə.Əbülhəsən.

**ÇALĞI[1]** *is.* Musiqi, musiqi aləti. *Xalq çalğı alətləri ansamblı. – Uzaqdan incə və narın ahənglə çalğı səsi eşidilməyə başlar.* H.Cavid. *Ayna .. diqqətlə çalğıya qulaq asdı.* Ə.Məmmədxanlı.

**ÇALĞI[2]** *is. məh.* Nazik çubuqlardan, tikan və s.-dən düzəldilən uzundəstəli süpürgə. *Qulu bir az gicəllənib çalğını götürdü, başladı həyəti süpürməyə.* S.Rəhimov.

**ÇALĞIÇI** *is.* Hər hansı bir musiqi alətində çalmağı özünə peşə etmiş adam; çalan. *Peşəkar çalğıçı. – ..Ağca xanım ortaya çıxıb çalğıçılara həmin rəqsi çalmağı əmr etdi.* S.S.Axundov. *Hamı əl vurur, çalğıçılar çalırlar.* Ə.Haqverdiyev.

**ÇALĞIÇILIQ** *is.* Çalğıçının işi, peşəsi.

**ÇALĞILAMAQ** b a x **çalmaq[2]**. *Zəhmətə adət eləmiş arvad bekar qalanda darıxır, iş olmayanda həyətə su səpib çalğılayırdı.* Ə.Vəliyev.

**ÇALXALAMA** "Çalxalamaq"dan *f.is.*

**ÇALXALAMAQ** *f.* 1. İçindəki mayenin hissəciklərini qarışdırmaq və ya həll etmək üçün tərpətmək, silkələmək. *Dərmanı içməkdən qabaq çalxalamaq. – Mehriban gülabpuşu tələsik götürüb çalxaladı.* H.Seyidbəyli. // Su ilə yaxalamaq, təmizləmək. *Saleh dağ sudan çaynikə alıb çalxaladı..* M.İbrahimov.

2. Atıb-tutmaq, silkələmək, yırğalamaq. *Maşın yol boyu bizi çalxaladı.*

**ÇALXALANMA** "Çalxalanmaq"dan *f.is.*

**ÇALXALANMAQ** *məch.* 1. Dalğalanmaq, təlatümə gəlmək. *Xəzər çalxalandı, səsində vüqar; Xəzər heç bayaqkı Xəzər deyildi.* N.Xəzri.

2. Atılıb-düşmək, silkələnmək, yırğalanmaq. *Maşın çalxalanır. – Lakin az keçməmiş birdən-birə təyyarəmiz havada çalxalanır, bizi atıb-tutmağa başlayır.* M.İbrahimov.

3. *məc.* Hərəkətə gəlmək, təlatümə gəlmək, həyəcana gəlmək, bir-birinə qarışmaq. *Dünyanın çalxalanmağa hazırlanan belə bir əsrində gənə qəzetəyə icazə vermək üçün o qədər istixarə elədi ki, bu istixarə axırda bəd gəldi.* C.Məmmədquluzadə. *Bağdad bu bəd xəbərdən çalxalandı bir anda.* B.Vahabzadə.

**ÇALXAMA** "Çalxamaq"dan *f.is.*

**ÇALXAMAQ** b a x **çalxalamaq** 1-ci mənada. [Göyçək] *südü bişirdi, iki gündən qalmış qatığı tuluğa yığıb çalxadı.* Ə.Vəliyev.

**ÇALXANIŞ** *is.* 1. Çalxanmaq işi, çalxanma, çalxantı.

2. *məc.* Həyəcan, vəlvələ, təlatüm. *Şərqin varmı dincliyi; Bu çalxanış ilində?* M.Müşfiq.

**ÇALXANMA** "Çalxanmaq"dan *f.is.*

**ÇALXANMAQ** 1. B a x **çalxalanmaq** 1-ci mənada. *Köksü atəşli qətrəyəm ondan; O isə çalxanan genişümman.* A.Şaiq. *Dənizin dalğaları çalxanıb səslənir.* S.Rəhimov.

2. B a x **çalxalanmaq** 2-ci mənada. *Tramvay çalxanıb dayandıqda* [Tahirin] *fikir sapı qırıldı.* M.Hüseyn.

**ÇALXANTI** b a x **çalxanış**. *Bu ağalar .. bu ümum çalxantıya qarşı çıxıb top-tüfəngin işə salınmasını tələb etsələr də, sakitlik qazana bilmir, asayişi bərpa edə bilmirdilər.* S.Rəhimov.

**ÇALI** *is.* Kol-kos, kolluq.

**ÇALIB-ÇAPMA** "Çalıb-çapmaq"dan *f.is.*

**ÇALIB-ÇAPMAQ** *f.* Talamaq, çapmaq, soymaq. [İbrahim xan:] *..Fətəli də acığa düşür, o da bizim kəndi-kəsəyi çalıb-çapır.* Çəmənzəminli.

**ÇALIB-OXUMA, ÇALIB-ÇAĞIRMA** "Çalıb-oxumaq", "çalıb-çağırmaq"dan *f.is.*

**ÇALIB-OXUMAQ, ÇALIB-ÇAĞIRMAQ** *f.* Bir havanı musiqi alətində çalaraq oxumaq. [Cavanlar] *Yusifgilə təklif etdilər ki, bir az çalıb-oxusunlar.* S.S.Axundov. *Üzlərdə şənlik, deyib-gülmək, çalıb-çağırmaq həvəsi görünür.* Mir Cəlal.

**ÇALIB-OYNAMA** "Çalıb-oynamaq"dan *f.is.*

**ÇALIB-OYNAMAQ** *f.* Musiqinin müşayiətilə oynayıb şənlənmək. *Cavanlar çalıb-oynayırdılar.*

**ÇALI-ÇIRPI** b a x **çırpı**. [Ovçu:] *Çalı-çırpıdan, otlardan qayırdıqları kiçik daxmalarda gizlənib bir əlilə torun ipini tutar.* A.Şaiq. [Komandir:] *Hamınıza əmr edirəm, hər kəs bu saat bir qucaq dolusu çalı-çırpı toplamalıdır.* S.Hüseyn.

**ÇALIQUŞU** *is. zool.* Sərçələr dəstəsindən başı tünd-qırmızı olan və kolluqları sevən quş.

**ÇALIN** *is.* Otu dəryaz, kərənti, ya maşınla çalmaq işi və bu işin başlandığı vaxt; biçin.

**ÇALI(N)-ÇARPAZ** b a x **çarpaz** 1-ci mənada. *Professor əynini qalınlaşdırdı, aşırmaları çalın-çarpaz keçirdi.* B.Bayramov.

**ÇALINÇI** *is.* Biçinçi, otçalan, kərəntiçi.

**ÇALINMA** "Çalınmaq"dan *f.is.*

**ÇALINMAQ** *məch.* 1. Musiqi alətində ifa edilmək. *Bu sırada yandakı görünməz məzarlıqda həzin və xəfif bir ahəng ilə çoban düdüyü çalınmağa başlar.* H.Cavid. *Sanki birdən çalınırdı; Qumrov, kaman, nayla ney.* Ə.Cavad.

2. Vurulmaq, eşidilmək. *..Qapının zəngi çalındı, Şirmayı .. tez qapını açdı.* M.Hüseyn.

3. Döyülmək, taqqıldadılmaq. *Dün qapım çalınarkən anladım, odur, haman; Çıxdım, ansızın öpdüm onun yüngül əllərin.* M.Müşfiq. *Bu halda evin qapısı çalındı.* H.Nəzərli.

4. Vurulmaq, qaxılmaq (mıx). // Mıxla bir yerə bənd edilmək, vurulmaq. *Yan küçədə sınıq-sökük darvazaya çəkməşəkilli iri bir lövhə çalınmışdı.* Çəmənzəminli.

5. Biçilmək. *Otlaqların otu çalınmışdır. Biçənək çalındı.*

**ÇALIŞDIRMA** "Çalışdırmaq"dan *f.is.*

**ÇALIŞDIRMAQ** *icb.* Çalışmağa, səy etməyə, işləməyə məcbur etmək; işlətmək. [Yaşlı kişi:] [Tacir] *..idarəsində çalışdırdığı əmələcatını da özü kimi pak etiqadlı, dindar bir müsəlman görmək istərdi.* S.Hüseyn.

**ÇALIŞIB-VURUŞMA, ÇALIŞIB-ÇAPALAMA** "Çalışıb-vuruşmaq", "çalışıb-çapalamaq"dan *f.is.*

**ÇALIŞIB-VURUŞMAQ, ÇALIŞIB-ÇAPALAMAQ** *f.* Çox çalışmaq, həddən artıq zəhmət çəkmək. *Çalışıb-vuruşub ev tikmək.*

**ÇALIŞQAN** *sif.* Çalışan, canyandıran, səy və qeyrət göstərən; cəhd edən, zəhmətsevən. *Çox çalışqan adamdır. – Araz çalışqan, zəhmətsevən, öz qüvvət və məharətinə inanan ciddi və iradəli bir gənc fəhlə idi.* A.Şaiq. *Müəllimin tərifi Bahadır üçün böyük səadətdi. O, bütün sinifdə ən çalışqan şagirdlərdən biri idi.* M.Hüseyn.

**ÇALIŞQANLIQ** *is.* Çalışqan adamın xasiyyəti; zəhmətsevərlik, canyandırma, səyetmə. *Özü hər iş bilir, çox da zirəkdir; Çalışqanlıqda misli yoxdur, təkdir.* C.Cabbarlı. *Bu qələbə məktəbdə uzun aylar boyu davam edən cidd-cəhdin, inadlı çalışqanlığın nəticəsi idi..* M.Rzaquluzadə.

**ÇALIŞMA** 1. "Çalışmaq"dan *f.is.*

2. *is.* Şagirdə evdə yerinə yetirmək üçün verilən tapşırıq. *Fonetikadan çalışmalar. Çalışmanı yerinə yetirmək.*

**ÇALIŞMAQ** *f.* 1. Bir şeyi əldə etmək üçün səy göstərmək, əmək sərf etmək, səy və qeyrət göstərmək, cidd-cəhd göstərmək, əlləşmək. *Qalib gəlməyə çalışmaq. – Deyirdilər ki, cavanlıqda Mirzə Səfər özü şairlik fikrinə düşüb, şeir demək üçün çox çalışmışdı, lakin bir nəticə hasil olmamışdı.* Ə.Haqverdiyev. *Hələ pilləkəndən enərkən Qulu Bəhramın qoluna girib, onu dəstədən kənara çəkməyə çalışdı.* Çəmənzəminli.

2. Fəaliyyət göstərmək, işləmək. *Eldarın fikrinə görə fabrik-zavodlarda və istehsalatda faydalı bir surətdə çalışa bilmək üçün qadınların savadı, yüksək təhsili olmalı imiş.* S.Hüseyn. // *dan.* Bir vəzifə daşımaq, bir peşədə işləmək. *Həştərxanda Zaqafqaziya Müsəlman İşləri Komissarlığında və "Hümmət" qəzetində çalışdığı bir ildən artıq müddətdə Ordubadinin əsərlərində günün vacib məsələlərinin izahı böyük yer tuturdu.* // *dan.* İşləmək, vəzifə daşımaq. *Ehtiyat xala .. ipək fabrikində, boyaq-naxış sexində çalışırdı.* Mir Cəlal. // İşləyərək yaratmaq, hazırlamaq, yaradıcı əməklə məşğul olmaq (adətən "üzərində" sözü ilə). *Dissertasiya üzərində çalışmaq.* ☐ **Öz üzərində çalışmaq** – öz biliyini, səviyyəsini, dünyagörüşünü artırmaq üçün müntəzəm məşğul olmaq, öz üzərində işləmək.

3. Zəhmət çəkmək, əmək sərf etmək, əlləşmək, iş görmək. *Kimindir sabahdan-axşama qədər; Yağışda, yağmurda çalışan əllər?* S.Vurğun. *Bu qız üç gün əvvəl atası ilə çəltik tarlasında çalışırdı.* Mir Cəlal.

**ÇALIŞ-VURUŞ** *zərf* Çox çalışaraq, əziyyətlə, zəhmətlə, çətinliklə. [Sevil Gülüşə:] *..Əvvəllər yoxsul idik, gündüzləri çalış-vuruş, əlimizə düşən bir parça çörəyi axşam şad ürəklə yeyib dinc yaşayırdıq.* C.Cabbarlı.

**ÇALLANMA, ÇALLAŞMA** "Çallanmaq", "çallaşmaq"dan *f.is.*

**ÇALLANMAQ, ÇALLAŞMAQ** *f.* Çal olmaq, bozarmaq. *Gömgöy olan bir taxıl, görürsən, bir gün çallayıb, bir gün ağarır, vağanıyır, bir azdan tökülür, çürüyür.* S.Rəhimov. // Ağarmağa başlamaq, dən düşmək. [Dostumun] *rast və gözəl qaməti əyilib, rəngi soluxub, gözlərinin işığı gedib, səsi zəiflənib, üzünün və başının tükləri çallanıb..* F.Köçərli. *İndi Rüstəmin qara gur saçları çoxdan seyrəkləşmiş və çallaşmışdı.* M.İbrahimov.

**ÇALMA¹** "Çalmaq¹"dan *f.is. Kamançada çalma.*

**ÇALMA²** "Çalmaq²"dan *f.is.*

**ÇALMA³** *is.* 1. Başa sarınan sarıq. *Hind kişilərinin başında çalma vardı.*

◊ **Çalma çalmaq (vurmaq)** – başına çalma sarımaq. *Çalmanı başa çaldı; Göz üstən qaşa çaldı. Mən namərdə neylədim; Ömrümü daşa çaldı.* (Bayatı). [Nazlı:] *Çalma vurub kürd qızına oxşayım?* Ə.Məmmədxanlı.

2. Başa örtülüb boynun dalında düyünlənən kiçik kəlağayı, ləçək, yaylıq və s.

**ÇALMAQ¹** *f.* 1. Çalğı alətində bir musiqi nömrəsi icra etmək, çalğı alətini səsləndirmək. *Tar çalmaq. Dumbul çalmaq. Pianino çalmaq. – Oxuyub-çalanlar yavaş-yavaş kamança və udu hazırlayıb çalmağa başladılar. Bir qədər ərəbcə çalıb-oxudular.* M.S.Ordubadi. *Mən bir aşiqəm ki, bu çaldığım saz; Dumanlı dağlara səs salacaqdır.* Ə.Cavad.

2. Vurmaq, çaxmaq, qaxmaq. *Sağ divardan sol divara bir mıx çalıb ip çəkər, gəlinin ipək çarşabını o ipin üstünə atardılar.* H.Sarabski.

3. Döymək, taqqıldatmaq, vurmaq. *Darvazanı çalmaq. – Çaldı o qapını... çaldı taqtaraq!* B.Vahabzadə.

4. Biçmək. *Bir az sonra əllərinə dəryaz götürüb ot çalardılar, taxıl biçərdilər.* İ.Hüseynov.

5. Sancmaq, vurmaq, dişləmək (həşərat və ilan haqqında). *Əqrəb uşağı çaldı.* – [Arıçı:] *Sən arıya dəyməsən, arı səni çalmaz.* S.Rəhimov. [Əlikram Gülüyə:] *İlanın quyruğunu basdalayarsan, qayıdar, baldırını çalar.* B.Bayramov.

6. Müəyyən çaları olmaq, bənzəmək; az bənzəmək, oxşamaq, andırmaq (rəng haqqında). *Qırmızıya çalmaq. Sarıya çalmaq. – Qilu-qala salan olsa sərini; Siyah çalar qızıl rəngi qıjhaqıj.* Aşıq Ələsgər. *Dağların hərəsi bir rəng çalır..* C.Məmmədquluzadə. *Qulunun başının tükləri, qaşları və kirpikləri xına rəngində idi, hətta dərisi belə kürənə çalırdı.* M.İbrahimov.

7. Səs çıxarmaq, səs vermək, səslə bildirmək (xəbər vermək), vurmaq. [Komandan] *təkrar evə girərkən saat on ikini çaldı.* H.Nəzərli. *Kürd Əhməd faytonçunu yola salıb, dalandan keçərək, balaca bir qapının zəngini çaldı.* M.İbrahimov.

8. Zərbə endirmək, vurmaq. *Zəyəm pristavı Oqarişşev Seyid Hənifəni .. tövləyə qatıb, o qədər onun burnuna çalır ki, bir vedrə qan axır.* C.Məmmədquluzadə. *Silahlı soldat Qədim dayının boynunun ardından yapışdı, onu darvazadan bayıra itələdi, iki təpik də arxadan ona çaldı.* S.Rəhimov.

9. *dan.* Qapıb almaq, qoparıb götürmək, almaq. *Şeyx Haşimi atını irəli sıçradır, bir göz qırpımında Leylini yerdən çalıb, yəhərin qaşı üzərinə atır.* Ə.Məmmədxanlı. *Əbiş paketi görər-görməz vəhşi bir hərəkətlə onun əlini cırmaqlayıb paketi çaldı.* S.Rəhimov.

10. *dan.* Oğurlamaq, çırpışdırmaq. *Mollanın börkünü çalıb oğru; Yüyürüb qaçdı bir bağa doğru.* M.Ə.Sabir. [Piran Rüstəmə:] *Sizinkilər çalar qaramal, qoyun; Bizimkilər ərzaq üçün saldırar.* H.Cavid.

11. Qarışdıraraq eynitərkibli kütlə halına gətirmək; qatılaşdırmaq, qəlizləşdirmək. [Bahar:] *Axşamadək cəhrə əyir, inək sağ, qatıq çal, nehrə çalxa, adını da tənbəl qoysunlar.* Ə.Haqverdiyev. [Pərşan Mayaya:] *Yaxşı, sən yumurta çal, mən də samovarı odlayım.* M.İbrahimov.

12. Qatışdıra-qatışdıra bişirmək. *Quymaq çalmaq. – Telli öz otağında halva çalırdı.* S.Hüseyn.

13. Bir sıra isimlərdən sonra gətirilərək mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: kirpik çalmaq, layla çalmaq, qanad çalmaq, əl çalmaq, qabar çalmaq, qələbə çalmaq və s.

**ÇALMAQ²** *f.* Çalğı² ilə süpürmək; çalğılamaq. *Dünənki kimi bu gün də Hüseyn böyük xırmanın qırağını əvvəlcə çaldı, sonra şanaladı.* S.Rəhimov. [Niyaz] *səhər alaqaranlıqdan yerindən qalxan kimi tövləyə girir, əvvəlcə atların altını kürəyir, təmizləyir, çalğı ilə çalır, quru peyinlə onların altını qurulayırdı.* Ə.Vəliyev.

**ÇALMAQ³** *f.* Çalma kimi başına sarımaq. [Abbas:] *Götür, çək sürməni qaşına, gəlsin; Çal əyri çalmanı başına, gəlsin.* "Abbas və Gülgəz". *Xanpəri acıqlı olanda kəlağayısının ucu ilə başını çalardı.* Ə.Vəliyev.

**ÇALMALI** *sif.* 1. Başında çalma olan (b a x **çalma³** 1-ci mənada). *Çalmalı seyidin son sözləri eşidildi.* Mir Cəlal.

2. Kiçik kəlağayı, ləçək və s.-ni çalma kimi başına sarımış (b a x **çalma** 2-ci mənada). *Bu əyri çalmalı, xumar gözlünün; Zülfünü dağıdan ellər sevinsin.* Qurbani. *Hamı dikib gözünü ağ çalmalı həkimə; Həkim xəcalətindən baxa bilmir heç kimə.* B.Vahabzadə.

**ÇALOV** *is.* 1. Səpələnən və ya un kimi şeyləri götürmək üçün yanları azacıq yuxarı əyilmiş, bir tərəfi açıq, qısadəstəli alət. *Çalovla un götürmək.*

2. *tex*. Ekskavatorda və bəzi başqa mexanizmlərdə torpaq və s. götürmək üçün qurğu; çanaq. [Əsəd] *kötüyü ekskavatorun çalovunda qaldırmaq istəyərkən paslanmış bir qutu gördü.* S.Vəliyev.

**ÇALOVVARİ** *sif.* Çalov şəklində olan, çalova oxşayan (b a x **çalov** 1-ci mənada).

**ÇALPANAQ** *is.* Odun və s. qırıntısı; talaşa. *Mürsəl kişi səhər tezdən qalxıb odun yararkən palıd kötüyündən bir çalpanaq qopub üzünə dəydi və qaşlarının arasını bərk qanatdı.* M.Hüseyn.

**ÇALPAPAQ(LI)** *sif.* Başında çalrəngli papaq olan, başına çalpapaq qoymuş. *Maarif şöbəsi müdiri çalpapaq, hündürboylu, qaraüzlü birisi idi.* T.Ş.Simurq. *Yapıncıya bürünmüş çalpapaq adamın bu sözlərini eşidib, Həmzə başını qaldırmağa məcbur oldu.* Ə.Əbülhəsən.

**ÇALPAŞIQ** *sif.* və *zərf* Bir-birinə qarışmış; dolaşıq, qarışıq, qat-qarışıq. [Surxay Aydına:] *O gün gördünmü, doktor da dedi, zehnin, təsəvvüratın çalpaşıq işləyir.* C.Cabbarlı. *Qoca mələkdən birisi dəftərdə hesab çalpaşıq düşdükcə turşalmış üzünü bunlara çöndərib deyirdi..* Çəmənzəminli.

**ÇALSAÇ(LI)** b a x **çalbaş(lı)**. *Sədrin otağından ucaboy, uzunsifət, çalsaç, səliqəli geyinmiş bir kişi çıxdı.* Mir Cəlal. *..Çalsaçlı, kobud görkəmli Sultan əmi ilə bu zərif, körpə gəlini yanaşı görmək lap qəribə olardı.* İ.Hüseynov.

**ÇALSAQQAL(LI)** *sif.* Saqqalı ağarmağa başlamış, saqqalı çallaşmış. *Ho! Ho! – deyə alçaqboylu, çalsaqqallı, gün altında işləməkdən kobud əl və üzü qaralmış arabaçımız Səməd kişi öküzləri səslədi.* T.Ş.Simurq. *Qara arxalıqlı, gödək, kök, çalsaqqal bir kişi irəli yeriyib, oğlanla qıza acıqlı-acıqlı nə isə deyirdi.* Mir Cəlal.

**ÇAMADAN** *is.* [*rus.* чемодан, əsli *fars.* camədan] Paltar və b. şeylər saxlamaq və aparmaq üçün qulplu qutu şəkilli qab. *Məşədi Həsən gəldi, gördü çamadanı qablayıram.* Ə.Haqverdiyev. [Nuriyyə:] *Çamadanla bağlamanı götürüb tez bayıra çıxdım.* İ.Əfəndiyev.

**ÇAMIR** *is.* 1. Palçıq, lil, lehmə. *Qışda hər yanda lil, çamır palçıq; Yayda tozdan havası olmur açıq.* A.Səhhət. [Pəricahan xanım:] *Qaşqa atı çamıra salmağa heyfim gəldi.* S.S.Axundov.

2. *məc.* Gerilik, cəhalət, mədəniyyətsizlik; bataqlıq mənasında. [Həyat:] *Kəndi ayağa qaldırmaq, çamırlardan çıxarıb, işıqlı .. yola çəkmək .. hər bir namuslu vətəndaşın vəzifəsi deyilmi?* M.İbrahimov.

**ÇAMIRLANMA** "Çamırlanmaq"dan *f.is.*

**ÇAMIRLANMAQ** *f.* 1. Palçıq olmaq, bataqlaşmaq. *Küçə çamırlanmışdı.*

2. Çamıra (palçığa) bulanmaq, çamırla örtülmək, çamıra batmaq.

**ÇAMIRLAŞMA** "Çamırlaşmaq"dan *f.is.*

**ÇAMIRLAŞMAQ** *f.* Çamır halına gəlmək, bataqlaşmaq.

**ÇAMIRLI** *sif.* Palçıqlı, lilli, lehməli, bataqlı. *Görsəm çamırlı bir küçədə oynayır haçaq; Çılpaq, ayaqyalın, başaçıq bir dəcəl uşaq.* A.Səhhət. *Çamırlı yerdən qalxan buxar dibsiz fəzanın dərinliklərinə uçub getdi.* M.Hüseyn. // Çamıra batmış.

**ÇAMIRLIQ** *is.* 1. Çamırla, lehmə ilə, palçıqla örtülü yer; çamır çox olan yer; palçıqlıq.

2. *köhn.* Qıçları, dizləri çamırdan qorumaq üçün meşindən və ya başqa materialdan hazırlanan geyim.

**ÇANAQ** *is.* 1. İçi oyulmaqla ağacdan (taxtadan) hazırlanan qab növü. *Çanağa un tökmək. – ..Kənarda taxtadan qayrılmış bir neçə su çanağı var idi.* C.Məmmədquluzadə.

2. Çanaq tutan qədər ölçü vahidi. *İki çanaq un.* – [Pakizə xala:] *Özüm də evin qabağında bir çanaq buğda əkmişəm.* Mir Cəlal. *Afaq, çoxdan bu yerləri tərk etmiş quşları da geri qaytarmaq istəyərək, bağçadakı təpəciyə gətirib bir çanaq arpa səpələdi.* Ə.Məmmədxanlı. // Sosialist inqilabının ilk illərində Azərbaycanda alınan natural verginin adı.

3. *tex.* Müxtəlif mexanizmlərdə, istehsalatda şey götürmək, boşaltmaq üçün çalovvari qurğu. *65 metr uzunluğunda nəhəng buruğu xatırladan polad qaldırıcı yerə şığıyıb cəld qalxır, çanağına aldığı torpağı boşaldaraq böyük bir qum təpəsi yaradırdı.* M.Əlizadə.

4. Krandan tökülən suyun axıb getməsi üçün onun altında yerləşdirilən deşikli çuxur ləyən.

5. Gövdə. *Gəmi çanağı.*

6. Bəzi heyvanların (tısbağa, timsah və s.) bədənini örtən çanaqvari sərt qabıq; qın. *Yüzlərcə Hindistan tısbağasının çanağını kəşkül qayırıb qoluna keçirən bu .. dilənçilərin hər biri bir cür qəsidə oxuyurdu.* M.S.Ordubadi.

7. Bəzi simli musiqi alətlərinin (tar, kamança və s.), içi boş olduğundan səsi əks etdirən və gücləndirən əsas hissəsi. *Sazın çanağı.* – [İnsanlar] *kamanların altına çanaqlar qayırıb, kirişlərin də sayını artırmaq yolu ilə nəticədə arfa və arfayabənzər çəng musiqi alətlərini ixtira edirlər.* Ə.Bədəlbəyli.

8. İnsan və heyvan skeletinin bel hissəsi – aşağı (heyvanlarda arxa) ətraflara dirənən və bel sümüyü üçün dayaq vəzifəsini görən sümük kəmər; çanaq sümüyü. *İnsanın çanağı heyvanlarınkına nisbətən geniş olub, kasa şəklindədir.* "İnsanın anatomiyası və fiziologiyası".

◊ **Çanaq .. başında çatlamaq (sınmaq)** – öz əlilə özünü bəlaya salan adam haqqında. [Zülfüqar Qarakişiyə:] *Onu bilirəm ki, çanaq mənim başımda çatlayacaq.* B.Bayramov. **Gözləri çanağından çıxmaq** – b a x **gözləri hədəqəsindən çıxmaq** (**"göz"**də).

**ÇANAQLI** *sif.* Çanağı olan, bədəni çanaqla örtülmüş (b a x **çanaq** 2-ci mənada). *Çanaqlı bağa. Çanaqlı ilbiz. – Çanaqlı yastıca yarpaq yığımına başlanan zaman öz yumurtalarını salır.* "Çay bitkisi".

**ÇANTA** *is.* Az və xırda şeylər qoyub daşımaq üçün parça, dəri və s.-dən tikilən kisə. *Poçtalyon çantası. Patron çantası. Məktəbli çantası. – Bir gün qəhrəmanım əlində çanta; Görüncə: – Gedirəm, – dedi, – fronta.* M.Müşfiq. [Fətullayev] *..yeməyə əl vurmazdan əvvəl çantasını açdı, oradakı möhürlü kağızlardan birini götürdü.* İ.Şıxlı.

**ÇANTALI** *sif.* Çantası olan, əlində və ya çiynində çanta gəzdirən. *Çantalı poçtalyon. – Bir azdan çiyni çantalı Rüxsarə ilə Ziba gəlib çıxdı.* S.Rəhimov. *Damdan-divardan boylanan çantalı uşaqları bəzən adbaad çağırıb içəri salardı.* Mir Cəlal.

**ÇAP** *is.* 1. Mətnin mətbəə üsulu ilə yığımı. ☐ **Çap etmək** – bu üsulla nəşr etmək, dərc etmək. *Bu kağızların heç birini biz çap etməmişik, necə ki oxucularımıza məlumdur və çap etməyəcəyik.* C.Məmmədquluzadə. **Çapa vermək** – çap olunmaq üçün təqdim etmək. *Mən xatirələrə əl vurmadan eynilə çapa verməyi lazım gördüm.* M.Hüseyn. **Çapdan çıxmaq** – nəşr edilmək, dərc edilmək, buraxılmaq. *Roman çapdan çıxmışdır.*

2. Çapdan çıxmış, buraxılmış, dərc olunmuş məcmuə, kitab və s. *"Qılınc və qələm" romanının üçüncü çapı.*

3. Silah lüləsi diametrinin ölçüsü; kalibr.

**ÇAPACAQ** *is.* Ət çapmaq üçün işlədilən kəsici alət; ət baltası. *Çapacaqla ət doğramaq.*

**ÇAPAQ** *is. zool.* Çoxalmaq, bəzən də qışlamaq üçün çaylara keçən bədəni yanlardan basıq balıq. *Siyənək balıqlarının – külmə, çapaq, çəki, suf, nərə növləri var.*

**ÇAPALAMA** "Çapalamaq"dan *f.is.*

**ÇAPALAMAQ** *f.* 1. Ağrıdan, qızdırmadan və başqa bir səbəb üzündən çırpınmaq, bədəni sarsılmaq, əl-ayağını oynatmaq. *Xosrov hələ də çınqıl üzərində çapalayırdı.* S.Rəhimov. [Müəllim] *qızdırmanın içərisində çapalayan* (f.is.) *körpəsinin xəstəliyə davam gətirə bilməyəcəyindən narahat idi.* Q.İlkin.

2. Zor bir vəziyyətdən qurtarmaq, yaxud da gücü çatmadığı bir işin öhdəsindən gəlmək üçün çox çalışmaq, əlləşmək, cəhd etmək, səy etmək. *At ha çapaladı, ha partdadı, ayaqlarını Dəmirçioğlunun əlindən qurtara bilmədi.* "Koroğlu". *Uşaq nə qədər çapaladısa, sürüşkən xəndəkdən çıxa bilmədi.* M.İbrahimov. // Məc. mənada. *Qaçay bu qarma-qarışıq fikirlərin torunda çapalayarkən uzun-uzadı siqnal səsi eşitdi.* İ.Məlikzadə. [Mollayev] *daim şübhə və tərəddüd içində çapalayır, ən yaxın dostlarından da şübhələnirdi.* M.Hüseyn.

**ÇAPAR** *is.* 1. Keçmişdə: atla bir yerə məktub, əmr, xəbər aparıb-gətirən şəxs; qasid, yamçı. [Həcər] *kağızı yazıb, başını bağlayıb, verdi bir çapara ki, apar, ver Ələsgərə.* "Aşıq Ələsgər". [Nofəl karvansara sahibinə:] *Nə oldu, qoca? Çaparlar qayıtdılarmı?* Ə.Məmmədxanlı.

2. *tar.* Atlı mühafizəçi. *Bəli, çaparlar hazırlanıb, atlılar, başlarında da padşahın oğlu birgünlük yola çıxdılar vəzirin qabağına.* (Nağıl). *O gün doğrudan da coşmuşdu atlar; Uçaraq yetişdi qırx-əlli çapar.* Ə.Cavad.

**ÇAPARAQ** *zərf* Yüyürərək, yüyürə-yüyürə, qaça-qaça, tez, becid, cəld. *Çaparaq getmək.* – [Qaraş:] *Budu, Əziz çaparaq gəlir, görək nə xəbər gətirir.* C.Məmmədquluzadə. *..Dilşad xanım xəlvəti evdən çıxdı və çaparaq qadınlar şöbəsi müdiri Mərcan xanımın evinə doğru yollandı.* T.Ş.Simurq.

**ÇAPARAQLAMA** "Çaparaqlamaq"dan *f.is.*

**ÇAPARAQLAMAQ** *f.* 1. Çaparaq getmək və ya gəlmək; yüyürmək. *Uşaq çaparaqladı.*

2. Atı bərk sürmək; qovmaq. *Atlılar kəndin içi ilə başıaşağı çaparaqlayıb böyük darvazalı həyətə girdilər.* S.Rəhimov.

**ÇAPARXANA** *is. tar.* Keçmişdə: çaparların poçt yolunda bir-birini əvəz etmək və ya atlarını dəyişdirmək üçün durduqları yer, poçt məntəqəsi. *Çaparxananı idarə edən Rəhim bəy tamam qəzada "Gödək Rəhim bəy" adilə məşhur idi.* Ə.Haqverdiyev.

**ÇAPÇI** *is.* Mətbəənin çap sexi işçisi.

**ÇAPÇILIQ** *is.* Çapçının sənəti, işi. *Çapçılıq kursu.*

**ÇAPXANA** *is.* Mətbəə, poliqrafiya. *Çapxana işçisi.*

**ÇAPIB-TALAMA** "Çapıb-talamaq"dan *f.is.*

**ÇAPIB-TALAMAQ** bax **çapmaq** 3-cü mənada. *Mirzə Fətəli öz dövrünün heç bir bacarığı olmayan, başqalarının hesabına yaşayan, quldur dəstələri düzəldib, karvanları çapıb-talayan, bununla da özlərini qoçaq göstərmək istəyən bəylərini də az tənqid etməmişdir...* Ə.Haqverdiyev.

**ÇAPIQ** *is*. 1. Bədənin hər hansı bir yerində sağalmış zədə yeri, yara yeri, yarıq izi. *Əjdərin alnında kiçik bir çapıq qalmışdı.* S.Rəhman. *Lətifin burnunun üstündəki çapıq olmasaydı, yəqin ki, hər şey çoxdan bəri yaddan çıxardı.* H.Seyidbəyli.

2. Bir şeyin səthində uzunsov oyuq, cızıq. *Stolun çapığı. Divarın çapığı.* // Sif. mənasında. *İri, çapıq bir daşı; Götürüb bu vaxt yerdən; Qəzəblə atdım suya.* Z.Xəlil.

**ÇAPILMA** "Çapılmaq"dan *f.is.*

**ÇAPILMAQ** *məch.* Çapacaq, balta və s. kəsərti ilə parçalanmaq, doğranmaq, yarılmaq, yaxud yaralanmaq. *Qəhrəmanın sol üzü çapılmışdı.* Ə.Vəliyev. [Mərminin bir qəlpəsindən] [aşpazın] *üst dodağı çapılıb, dişləri qırılmışdı.* Ə.Əbülhəsən.

**ÇAPI(R)TMA** "Çapı(r)tmaq"dan *f.is.*

**ÇAPI(R)TMAQ** *f.* Çapmaq, bərk sürmək (adətən at haqqında). *Yenə çapırdacaq atını külək; İsti ocaqları soyudacaqdır.* S.Vurğun. [Ağsaqqal kişi:] *İndi necə deyərlər, hər fırıldaq kəndlinin başındadır, qardaş, yetən atını çapıdır.* Mir Cəlal.

**ÇAPIŞ** *is.* Çapmaq işi, çapma (at haqqında). *Tərlan qızğın bir çapışla irəli atılır, qabağına nə gəlirsə vurub keçirdi.* Ə.Məmmədxanlı.

**ÇAPIŞMA** "Çapışmaq"dan *f.is.*

**ÇAPIŞMAQ** *qarş*. At çapmaqda yarışmaq. *Budur, aşağıdan üçüncü dolaydan başıyuxarı iki atlı çapışır.* C.Məmmədquluzadə. [Həsən:] *Gəl çapışaq, – deyə yoldaşım təklif etdi.. Mən irəlidən, Həsən arxadan atların başını buraxdıq.* S.S.Axundov.

**...çaplı** Adətən silah adlarının əvvəlinə gətirilərək, onların lülələrinin diametrini (ölçüsünü) göstərir; kalibrli. *İriçaplı top* (*pulemyot*). *Ortaçaplı tüfəng.* – *..At qoşulmuş toplar, iriçaplı pulemyotlar vaqonlardan düşürüldü.* İ.Şıxlı.

**ÇAPQIN** *is.* Soyğunçuluq məqsədilə silahlı basqın; quldurluq, çapovulçuluq, yolkəsmə, çapqınçılıq. *Qubernator həmişə deyirdi: – Çaparxanaların hər birində Rəhim bəy kimi mənim bir adamım olsa, yolda heç bir çapqın olmaz, qurd qoyun ilə otlar.* Ə.Haqverdiyev. *Jandarmların rəhmsiz sifəti, çapqın, talan, qanlı xəncərlər* [Telli xalanın] *gözü önündə olmuşdu*. Mir Cəlal.

**ÇAPQINÇI** *is.* Çapqınla məşğul olan adam; quldur, soyğunçu, çapovulçu, yolkəsən. *Çapqınçı dəstəsi.*

**ÇAPQINÇILIQ** bax **çapqın**. *Əslən mühit və şəraitə görə gözüaçıq olan bu namuslu arvad böyük analıq duyğusu ilə başa düşmüşdü ki, bu çapqınçılıq, oğurluq elə belə qalmayacaq.* Ə.Əbülhəsən.

**ÇAPMA** "Çapmaq"dan *f.is.*

**ÇAPMAQ** *f.* 1. Çapacaq, balta, külüng və s. ilə parçalamaq, doğramaq. *Ət çapmaq. Odun çapmaq. – Belə ki, hansı kənd Şurasının adamı harada işləyəcək, nə qədər iş görəcək, torpaq qaldıracaq, daş çapacaq, meşə çıxaracaq – hamısı nəzərə alınmışdı.* S.Rəhimov.

2. İti sürmək (atı). *Odur atlılar dəstə-dəstə, ya tək-tək uzaqdan görsənirlər. Bir qeyriləri də şəhərdən çıxıb aşağı tərəfə çapırlar..* C.Məmmədquluzadə. // Sürətlə getmək, qaçmaq (at). *Hara belə çapırsan? – At kişnəyir, çapır, toz qopur dağdan; İştə bir hənirti gəlir uzaqdan.* A.Səhhət. // Qaçıb getmək. *Bəli, elə o lazımdır ki, Məşədinin gözü sataşsın övrətin qıçlarına, tez çapacaq mollanın yanına ki, filan övrəti al mənə!* C.Məmmədquluzadə.

3. Zorla və ya başqa yolla var-yoxunu əlindən almaq; talamaq, soymaq, çapıb-talamaq. [Hacı Nuru şair:] *Avar ləzgisi altmış il bundan əqdəm Xanbutayın sərkərdəliyilə Nuxunu gəlib çapdığını nəzm etmişəm.* M.F.Axundzadə.

4. Kəsərti ilə, iti bir şeylə yaralamaq. *..Mahmud ayağını balta ilə çapdı.* Z.Xəlil. [Şəmsi] *buradan yıxılıb üzünü çapmışdı.* H.Seyidbəyli.

**ÇAPOVUL** 1. Bax **çapqın**.

2. Bax **çapqınçı**. *Çapovul Osman paşa; Şirvanı tutdu daşa.* M.Müşfiq. *Görünür, rəis yaylaqda asayiş düzəldəcək, çapovulların qabağını alacaqdı.* Mir Cəlal.

**ÇAPOVULÇULUQ** bax **çapovul** 1-ci mənada. [Qazan xan Quldurbaşıya:] *Sənin oğullarını əllərində qılınc çapovulçuluqda, basqınçılıqda tutdum, yataqdan gətirmədim, qorxaq tülkü!* M.Rzaquluzadə.

**ÇAR** *is.* [*rus.*] *tar.* Padşah; rus padşahı. *Çar istibdadı. – Çar zamanı idi, istibdadın ən şiddətli, ən qızğın vaxtı idi..* E.Sultanov. *Çarın orduları ikinci dəfə; Hücuma başladı Bakı tərəfə.* S.Vurğun.

**ÇARDAQ** [*fars.*] 1. Bax **talvar** 1-ci mənada. *Əlli qədəm bir-birindən aralı çadırların aşağı tərəfində ağacdan bir çardaq tikilib..* M.F.Axundzadə. *Həyətin küncündə, çardağın altında bir çılpaq ağ at bağlanmışdı.* C.Məmmədquluzadə.

2. Bax **talvar** 3-cü mənada. *Gəzəcəkdir qədəm-qədəm bağımı; Görəcəkdir üzümlü çardağımı.* A.Səhhət. *Nənəqız vedrəni götürüb, böyürdəki krandan doldurdu və qapıdakı təkcə əncir ağacının və çardağa qaldırılan tənəklərin dibinə su tökməyə başladı.* S.Rəhimov.

**ÇARDAQLI** *sif.* Çardağı olan, talvarlı. *Çardaqlı həyət. Çardaqlı ev.*

**ÇARƏ** *is.* [*fars.*] 1. Bir şeyin əldə edilməsinə, bir nəticəyə gəlməyə, çətin bir məsələnin həllinə mane olan əngəlləri aradan qaldırmaq üçün lazım olan çıxış yolu; tədbir, vasitə, əlac. ◻ **Çarə aramaq (axtarmaq, görmək)** – çıxış yolu axtarmaq, əlac aramaq. [Telli] *ağır bir şeyin altında qalmış kimi əzilir, qurtarması üçün çarə arayırdı.* S.Hüseyn. **Çarə etmək (tapmaq, qılmaq)** – çıxış yolu tapmaq, vəziyyətdən çıxmaq, əlac tapmaq. [Gülsənəm:] *Ay Piri baba, .. bizə bir çarə qıl.* S.S.Axundov. [Mirzə Cəlil] *özü də bilmirdi neyləsin, nə cür çarə tapıb, işin içindən çıxsın.* Ə.Vəliyev. **Çarəsi kəsilmək** – çarəsiz qalmaq, əlacı kəsilmək, çıxış yolu tapmamaq. *Padşahın çarəsi kəsildi, qızı keçələ verdi.* (Nağıl). *Aslan bəyin hər yandan çarəsi kəsildi.* A.Şaiq.

2. Əlac, kömək, yardım. *Dərdini yazıb deyirsən ki, şəhərinizin həkimlərinin heç biri sənə bir çarə edə bilmədilər.* C.Məmmədquluzadə. [Zəhra:] *Daha bir çarə yox, keçən keçmiş; Çünki Sənan ürəklə and içmiş.* H.Cavid.

◊ **Başına çarə qılmaq (görmək)** – bax **baş**. *Dosta layiq yoxdu, Zakir, sovqatın; Gör başına çara bu gündən belə.* Q.Zakir. **Nə çarə** – nə etməli, nə etmək olar, nə edə bilərik, istər-istəməz razı olmalıyıq.

**ÇARƏSİZ** 1. *zərf* Əlacsız, əlacı kəsilərək, məcbur olaraq, naçar. *Durdum, mağaranın ağzından içəri baxdım. Bir şey görmədim, çarəsiz mağaraya girdim.* A.Şaiq. *Rəna gedən zaman dönüb baxdı qız; Neyləyə bilərdi, baxdı çarəsiz.* M.Rahim. ◻ **Çarəsiz qalmaq** – məcbur olmaq, əlacsız qalmaq, əlacı kəsilmək. *Novruz çarəsiz qalıb atları açdı.* N.Nərimanov. *Kor Seyid əvvəl buna razı olmayırsa da, sonra çarəsiz qalaraq Məsməni Bakıya göndərir.* S.Hüseyn. // *sif.* Başqa bir çıxış yolu olmayan, həlli mümkün olmayan; naçar.

2. *sif.* Çarəsi, əlacı olmayan, müalicə oluna bilməyən; sağalmaz. *Çarəsiz bir xəstəlik. – Çarəsiz dərdə loğman da acizdir.* (Ata. sözü). *Kor, şil, kar, çolaq, şikəst və hər cür çarəsiz dərdlərə düşən xəstələr o pirə gəlib "şəfa" tapırdılar.* E.Sultanov.

**ÇARƏSİZLİK** *is.* Çarəsi, əlacı, çıxış yolu olmayan bir vəziyyət; əlacsızlıq, acizlik. *Öz çarəsizliyindən utanan xalq məbhut çocuqlar kimi yan-yörəsinə baxırdı.* Ə.Əbülhəsən.

**ÇARGAH** *is.* [*fars.*] Azərbaycan klassik muğamlarından birinin adı. *Dinləsin səsini bir çargah kimi; Qarılar, qocalar, yeni nəsillər!* M.Müşfiq.

**ÇARGO(V)** *is.* [*fars.*] *köhn.* Dörd öküz qoşulmuş araba, cüt. [Tubu Həsənə:] *Bircə de görüm, sən cüt əkən vaxt ağa gəlib sənin çargovuna minəcəkdirmi?* Ə.Haqverdiyev.

**ÇARGÜL** *sif.* [*fars.*] Dördbucaq(lı). *..Blindaj təqribən üç kvadratmetrlik, üç xırda pəncərəli, çargül bir otaqdan ibarətdi.* Çəmənzəminli. *Qonaqlar gözəl, çargül xalçaya maraqla baxırdılar.* Mir Cəlal.

**ÇARHOVUZ** [*fars.* ça(ha)r və *ər.* hövz] Böyük hovuz. [Qulu:] *Ağa, bağçada çarhovuza su buraxmışdım.* S.S.Axundov. *Bəzi həyətlərdə su quyusu və çarhovuz görünərdi.* H.Sarabski.

**ÇARHOVUZLU** *sif.* Çarhovuzu olan, böyük hovuzlu. *Çarhovuzlu həyət.*

**ÇARX** *is.* [*fars.*] 1. Öz oxu ətrafında fırlanmaqla minik və ya başqa nəqliyyat vasitələrini hərəkətə gətirən (dəndənəli və ya bütöv şəkildə) dairə; təkər. *Araba çarxı. Velosiped çarxı. Avtomobilin çarxı. – Bir yerdə bir araba atını yıxılmış, ya bir arabanı oxundan və ya da çarxından sınan görsəydi,* [Qurbanqulu] *dərhal kömək edərdi..* T.Ş.Simurq. *Qatarın çarxları durmadan dönür; İşıqlar görünmür, işıqlar sönür.* N.Rəfibəyli.

2. Müxtəlif mexanizmlərdə, qurğularda hərəkəti ötürən və nizama salan çarxşəkilli hissə. *Dəzgahın çarxı. Dişli çarx. – Çarxlar hərlənir, xam pambığın çiyidini bir tərəfə çıxarır, mahlıcını bir tərəfə qalaqlayırdı.* Ə.Vəliyev.

3. Kəsər alətləri itiləmək üçün dairəvi bülöv daşı olan alət. *Bıçağı çarxda itiləmək.*

**ÇARXÇI** *is.* Kəsər alətləri çarxda (3-cü mənada) itiləməklə məşğul olan adam – usta. [Adil:] *Səhər tezdən alverə çıxan kimi bir çarxçını küçədə əylədim.* B.Bayramov.

**ÇARXÇILIQ** *is.* Çarxçının sənəti, peşəsi, işi.

**ÇARXI**: **çarxı xoruzu** – iri, döyüşkən xoruz cinsi. [Qasım əmi:] *Oğlum, canın üçün, xalova deyərəm, sənə bir yaxşı çarxı xoruzu gətirsin.* C.Məmmədquluzadə.

◊ **Çarxı xoruzu kimi** – dalaşqan, davakar adam haqqında. [Hürü:] *Nə olacaq, dəliqudurmuş atan təzədən çarxı xoruzu kimi girib meydana.* N.Vəzirov.

**ÇARXŞƏKİLLİ** b a x **çarxvari**.

**ÇARXVARİ** *sif.* Çarx şəklində olan; dairəvi, çarxşəkilli.

**ÇARIQ** *is.* 1. Keçmişdə: kəndlilərin geydiyi aşılanmış göndən tikilən ayaqqabı. *Keçəl Həmzə çarığını geydi, patavasını bərkitdi.* "Koroğlu". *Vəliqulu kənarda çömbəlib başladı çarıqları çıxartmağa.* C.Məmmədquluzadə.

2. Yüngül ev ayaqqabısı, şap-şap növü. *Qadın çarığı.*

**ÇARIQÇI** *is.* Keçmişdə: çarıq tikib satmaqla məşğul olan adam.

**ÇARIQÇILIQ** *is. köhn.* Çarıqçının sənəti, işi, peşəsi.

**ÇARIQLI** *sif.* Çarıq geymiş, ayağında çarıq olan. *Malik motalpapaqlı, patavalı, çarıqlı, nimdaş paltarlı kəndliləri uzaqdan süzüb, qeyri-adi həyəcan içində olduqlarını anladı.* M.İbrahimov. // *məc.* Keçmişdə cəhalət, gerilik, mədəniyyətsizlik mənasında işlənmişdir. [Hacı Osman:] *..xanın yanında bizim adımızı çəkmək olmur. O saat başlayır ki, mən ayağı çarıqlı, motalpapaq çobanın oğluna qız verməræm.* Ə.Haqverdiyev.

**ÇARIQLIQ** *sif. köhn.* Çarıq tikmək üçün yarayan. *Çarıqlıq dəri.*

**ÇARİ́ÇA** [rus.] 1. Qadın çar, imperatriçə.

2. Çarın arvadı.

**ÇARİZM** [*rus.*] Qeyri-məhdud hakimiyyətin təkcə padşaha, çara məxsus olduğu dövlət idarə üsulu; çar üsuli-idarəsi; çarlıq. *Çarizmin devrilməsi. – Yoxsa bu qalanın hər divar daşı, Olacaq çarizmə bir məzar daşı.* S.Vurğun. *Knyaz Voronsovun Tiflisdə bütün Qafqazda ilk dəfə olaraq teatr yaratmaqdan məqsədi Zaqafqaziyada çarizmin möhkəmləndirilməsi üçün teatrdan bir vasitə kimi istifadə etmək idi.* N.Vəzirov.

**ÇARQAT** *is. köhn.* Böyük baş yaylığı. *Səba xanım bu sözləri dedikdən sonra ipək çarqatını kənara ataraq boynundakı yara yerlərini göstərdi.* M.S.Ordubadi. *Vəliqulu içəri*

*girən kimi Zeynəb bir baxdı oğlunun üzünə .. və sağ əlilə çarqatını gözlərinin üstə aparan kimi Vəliqulu başa düşdü ki, anası ağlayır.* C.Məmmədquluzadə.

**ÇARLIQ** b a x **çarizm**. *O zaman mən gəzərkən Gürcüstan torpağında; Qanlı bir ləkə gördüm; Çarlığın bayrağında.* Ə.Cavad. *Çökür abidəsi qanlı çarlığın; Çökür məhkəməsi riyakarlığın.* M.Müşfiq.

**ÇARMIX** *is.* [*fars.*] *köhn.* Müqəssirin əllərini və ayaqlarını bağlamaq üçün istifadə edilən cəza aləti. .. *Qırmızı donlu şəhər cəlladı onu bu uca dar ağacında çarmıxa çəkərək, geniş açılmış qollarını köndələninə çarmıxın tirinə, uzun və çılpaq ayaqlarını da çarmıxın dirəyinə mıxlamışdı.* Ə.Məmmədxanlı. ☐ **Çarmıxa çəkmək** – 1) bu üsulla cəza vermək, cəzalandırmaq, öldürmək; *Bu xatadan sovuşsam, çarmıxa çəksələr də, Ağzımı kilidlərəm, danışmaram bir daha.* B.Vahabzadə. 2) *məc.* çox işgəncə vermək, incitmək, əziyyət vermək. [Səlimnaz:] [Xanım] *bir nəlbəki düyüdən ötrü məni çarmıxa çəkibdi.* N.Vəzirov.

**ÇAR-NAÇAR** *zərf* [*fars.*] Əlacsız, istər-istəməz, məcburən, zorla. *Molla nə qədər üzr istəyirsə, mümkün olmur. Axırda çar-naçar nişan alıb atır.* "M.N.lətif.". *Zeynal bəy .. çar-naçar sıçrayıb qapının dalında gizləndi.* Çəmənzəminli.

**ÇARPANAQ, ÇARPARA** *is.* Metal, daş parçası, qırıntı; qəlpə. *Yan-yörəyə şarıltı ilə daşkəsək və metal çarpanaqları töküldü.* Ə.Əbülhəsən. // Topda, tüfəngdə saçma kimi istifadə edilən qurğuşun və s. metal qırıntıları; qəlpə. *Toplar, ağır toplar verməyir aman; Qırılmış şüşələr çarparalardan.* M.Rahim.

**ÇARPAŞIQ** 1. *sif.* Dolaşıq, dolanbac, qarışıq. *Qudurğan qasırğa, çarpaşıq yollar; Yolumda zülmət var, uçurumlar var.* Ə.Cavad. *Bu çarpaşıq dalğalarda özün göstər mənə yol.* S.Vurğun.

2. *is. məc.* Anlaşılmazlıq, dolaşıqlıq, keşməkeş. *Ah! Ölən məhəbbət! Ah! Ölən istək! Nədir həyatdakı bu çarpaşıqlar?!* S.Vurğun. *Təbiətin məğrur xilqəti olan insan nə qədər də çarpaşıqlar, nə qədər də döyüşkən duyğular, nə qədər də tufanlı-boranlı hallar keçirir?* S.Rəhimov.

**ÇARPAYI** *is.* [*fars.*] Yataq mebeli, dördayaqlı dəmir və ya taxtadan yataqlıq. *Uşaq çarpayısı. Taxta çarpayı. – Yaralı çarpayıda uzanmışdı.* Ə.Məmmədxanlı. *Təzə döşəküzü gətirib bu dəm; Anam çarpayıda yer açdı mənə.* Z.Xəlil.

**ÇARPAYILIQ** *is.* Rəqəmlərdən sonra gələrək xəstəxanada neçə xəstənin müalicə olunduğunu bildirir. *300 çarpayılıq xəstəxana. – Qəsəbədə yerləşən köhnə xəstəxananın yanında 100 çarpayılıq yeni bina tikilmişdir.*

**ÇARPAZ** *sif.* və *zərf* 1. Bir-birini kəsib keçən, xaç şəklində; xaçvari, çataq. *Çarpaz cizgilər. – Çarpaz taxtalarla mıxlanmış köhnə bir qapının üstündə tabaşirlə yazmışdılar: "Raykom bağlıdır, hamı cəbhəyə getdi".* Mir Cəlal.

2. *biol.* Çarpaz cütləşdirilmiş və ya çarpaz tozlandırılmış (b a x **çarpazlaşdırmaq** 2-ci mənada). *Çarpaz cütləşdirmə. – Miçurin bu iki bitkini bir-birilə çarpaz tozlandırmağa başladı.* M.Axundov.

3. Düymə, ilgək.

◊ **Çarpaz vurmaq** – b a x **badalaq vurmaq** 1-ci mənada (**"badalaq"**da).

**ÇARPAZLAMA** "Çarpazlamaq"dan *f.is.*

**ÇARPAZLAMAQ** *f.* Bir-birinin üstünə xaçvari qoymaq, çarpaz etmək; çataqlamaq. *Nökər Cəfərin qollarını burub dalında çarpazladı.* M.İbrahimov. *Ata isə qollarını çarpazlayıb, ayaq üstə durmuş və gözlərini xəstənin qalxıb-enən sinəsinə zilləmişdi.* Q.İlkin.

**ÇARPAZLANMA** "Çarpazlanmaq"dan *f.is.*

**ÇARPAZLANMAQ** *məch.* 1. Xaçvari şəkildə bir-birinin üstünə qoyulmaq, çarpaz edilmək; çataqlanmaq.

2. B a x **aşırmaq** 3-cü mənada.

**ÇARPAZLAŞDIRILMA** *biol.* "Çarpazlaşdırılmaq"dan *f.is. Qarabağ atlarının ərəb atları ilə çarpazlaşdırılmasından əsas məqsəd nəslin boyunu artırmaqdır.* R.Səttarzadə.

**ÇARPAZLAŞDIRILMAQ** "Çarpazlaşdırmaq"dan *məch.*

**ÇARPAZLAŞDIRMA** *biol.* "Çarpazlaşdırmaq"dan *f.is. Yeni tip qonur mal əslində II-III nəsildən olan mələz heyvanlar bir-birilə cütləşdirilərək yaradıcı çarpazlaşdırma yolu ilə əldə edilən məhsuldur.*

**ÇARPAZLAŞDIRMAQ** *f.* 1. Çarpaz etmək, xaçvari qoymaq. *Əllərini sinəsində çarpazlaşdırmaq.*

2. *biol.* Yeni heyvan, bitki növü və ya cinsi almaq üçün müxtəlif növdən, cinsdən olan heyvanları cütləşdirmək və ya bitkiləri tozlandırmaq. *Qarabağ atı ilə ərəb atını çarpazlaşdırmaq. – Miçurin Sibir sortlarından iri meyvəsi olan kitaykanı Amerika sortu sarı belflorla çarpazlaşdırmışdı.* "Darvinizm əsasları".

**ÇARPAZLAŞMA** "Çarpazlaşmaq"dan *f.is.* *Təbii çarpazlaşma. Dillərin çarpazlaşması.*

**ÇARPAZLAŞMAQ** *f.* 1. Bir-birini kəsmək, bir-birinin üstündən xaçvari keçmək; kəsişmək. *Dəmiryol xətlərinin çarpazlaşdığı yerdə qaranlığın içərisindən bir səs eşitdilər.* Ə.Sadıq.

2. *biol.* Cütləşmə və ya tozlanma nəticəsində bir-birilə birləşmək (müxtəlif növdən, cinsdən olan heyvanlar və ya bitkilər haqqında). *Hind-Çin və Afrika pambıq bitkiləri bir-birilə asanlıqla çarpazlaşır.*

3. *dilç.* Birləşmə prosesində bir-birinə qarşılıqlı təsir göstərmək (bu proses nəticəsində iki və ya bir neçə dilin, dialektin biri, bir qayda olaraq, aradan çıxır).

**ÇARPILMA** "Çarpılmaq"dan *f.is.*

**ÇARPILMAQ** *f.* Zərblə, şiddətlə dəymək, toxunmaq, toqquşmaq, vurmaq. *Dəniz yavaş-yavaş uğuldayır, dalğalar zərblə qayalara çarpılaraq şırıldayırdı.* M.Hüseyn.

**ÇARPIŞMA** 1. "Çarpışmaq"dan *f.is.*

2. Vuruşma, toqquşma, döyüş, savaş. *Körpünü ortaya qədər gələn düşmənlərin önündə Əmrah da at belində qılıncla çarpışırdı.* İ.Şıxlı. *Bu yerlə çarpışan, göylə əlləşən; Dostdan, aşinadan necə əl çəkim?* M.Müşfiq.

**ÇARPIŞMAQ** *f.* Vuruşmaq, döyüşmək; mübarizə etmək. *İrəlidə piyadalar çarpışır.* H.Nəzərli. [İncə:] *..Ox, iki il çarpışdım, axır olmadı, məni öldürmək istədilər..* C.Cabbarlı.

**ÇARPMA** "Çarpmaq"dan *f.is.*

**ÇARPMAQ** *f.* 1. Zərblə, şiddətlə toxunmaq, dəymək, vurmaq. *Kür nəhri sahildəki iri daşlara və sarı qayalara çarparaq hiddətlə çağlayırdı.* A.Şaiq. *Nəhayət, maşın iri qayalara çarparaq köpüklənə-köpüklənə axan çayın kənarına çatıb dayandı.* İ.Əfəndiyev.

2. B a x **çırpınmaq** 1-ci mənada. *Köksündə çarpardı polad ürəyi; Gözündə parlardı uca diləyi.* A.Şaiq. *Sən onun qəhrəman, igid oğlusan; Çarpan ürəyisən, vuran qolusan!* S.Vurğun.

**ÇARSU** *is.* [*fars.*] *köhn.* Dükanlar olan yer, qapalı bazar, çarşı. *Şəhərlər, kəndlər xalq nəğmələri və musiqi tərənnümləri altında bayram edir, bazarlar, çarsular bəzənmiş və çıraqbanlıq nəticəsində qaranlıq gecələr gündüz kimi işıqlanmışdır.* M.S.Ordubadi.

**ÇARŞAB** b a x **çadra**. *Gülsüm bir küncdə üzüörtülü, başında çarşab əyləşmişdi.* Ə.Haqverdiyev. *Çaydan sonra Nənəxanım Yetər ilə çarşaba bürünüb, qız axtarmağa getdilər.* Çəmənzəminli.

**ÇARŞABLI** b a x **çadralı**. *Əyri küçələrin birində* [həkim] *bir çarşablı qadına rast gəldi.* Çəmənzəminli.

**ÇARŞABSIZ** b a x **çadrasız**.

**ÇARŞI** *is.* [*fars.*] b a x **çarsu**. *Mən üz qoydum bazara tərəf. Xəyalımda qoymuşdum: gedərəm düz baqqal çarşısına və buzu allam, gətirrəm və şəhərdə oradan da savayı bilmirdim, harada buz satırlar.* C.Məmmədquluzadə.

**ÇARTER** *is.* [*ing.*] Kirayəyə götürülmüş nəqliyyat vasitəsi.

**ÇARTİ́ST** [*ing.*] Çartizm tərəfdarı, iştirakçısı.

**ÇARTİ́ZM** [*ing.*] İngiltərədə XIX əsrin 30-40-cı illərində fəhlələrin siyasi hüquq əldə etmək və iqtisadi vəziyyətlərini yaxşılaşdırmaq uğrunda inqilabi hərəkatı.

**ÇARVADAR** *is.* [*fars.*] *köhn.* Yük heyvanı ilə muzdla yük daşımaqla məşğul olan adam. *Bizim karvanımız beş çarvadar atından ibarət idi.* S.Hüseyn. *Çarvadar olduğu üçün Ciniş Əhmədin özü kimi atı da ən çətin yolu hər vaxt hər bir şəraitdə gecə də, gündüz də çox yaxşı gedə bilirdi.* Ə.Əbülhəsən.

**ÇARVADARBAŞI** *is. köhn.* Çarvadarlara başçılıq edən adam, baş çarvadar. *Üst-başlarını toz basmış müsafirlər çarvadarbaşının haqqını verib, karvansaradan çıxmağa başladılar.* P.Makulu.

**ÇARVADARLIQ** *is. köhn.* Çarvadarın işi, peşəsi. *Qərəz,* [Məmmədhəsən əminin] *tutmadı işi, əliboş kəndə qayıdıb, üç-dörd eşşək*

*alıb başladı çarvadarlığı.* C.Məmmədquluzadə. *Bu kəndin əhli əkinçilik və çarvadarlıqla güzəran edərdi.* S.S.Axundov.

**ÇAŞ** 1. *sif.* Əyri, çəp. *Çaş göz. Çaş baxış. – İki tərəfə baxan çaş olar.* (Ata. sözü). *Bağda maral çaş mələr; Çaş dolanar, çaş mələr; Mənim ahu-zarımdan; Dağ inildər, daş mələr.* (Bayatı).

2. B a x **çaşbaş**. *Rüstəm kişinin baxışları Şərəfoğlunun baxışları ilə çarpazlaşdıqda suala çaş cavab vermədi: – İcazə üçün gəlmişəm!* M.İbrahimov. ◻ **Çaş qalmaq** – b a x **çaşbaş qalmaq**. *Lənət sənə kor şeytan, – deyə Alıxan ağa çaş qalır.* S.Rəhimov. *Xalıqverdi kişi çaş qalmışdı.* Ə.Vəliyev. **Çaş salmaq** – b a x **çaşbaş salmaq**. [Tahir:] *Bəlkə çaş salıram, bəlkə bu, İmran dayının başqa qızıdır?* M.Hüseyn.

**ÇAŞBAŞ** *sif.* və *zərf* Qarışıq, qatqarışıq, dolaşıq, çaş, çaşqın, çaşmış. [Şeyda:] *Fikrim elə çaşbaşdır ki, Telli xala, avtobusları dəyişik salıb, sizin Göytəpə əvəzinə gedib çıxmışam Qaratəpəyə.* Ə.Məmmədxanlı. ◻ **Çaşbaş qalmaq** – nə edəcəyini bilməmək, qəti bir fikrə gələ bilməmək, fikri qarışmaq, çaş qalmaq, çaşbaş olmaq. [Rəşid:] *Mən çaşbaş qalıb, Nailənin geniş açılmış gözlərinə, qanı qaçmış zərif dodaqlarına baxdım və küçəyə yüyürdüm.* İ.Hüseynov. **Çaşbaş qoymaq** – fikrini qarışdırmaq, çaş qoymaq, çaşdırmaq, qəti bir fikrə gəlməyə qoymamaq. *Arvad bir az da cinləndi: – Ay qızım, bu də təzə qaydalar, təzə haqq-hesablar deyil ki, məni çaşbaş qoyasınız.* Mir Cəlal. **Çaşbaş olmaq** – b a x **çaşbaş qalmaq**. [Axund:] *Özgə molla olsaydı, çoxdan çaşbaş olmuşdu.* B.Talıblı. **Çaşbaş salmaq** – bir-birinə qarışdırmaq, bir-birindən ayırd edə bilməmək, çaş salmaq. *Kənd arasında dolaşan söhbət çoxlarını çaşbaş salmışdı.* İ.Şıxlı. *Yoxsa yenə nömrələri çaşbaş saldın? – deyə Validə gülə-gülə soruşdu.* H.Seyidbəyli.

**ÇAŞDIRMA** "Çaşdırmaq"dan *f.is.*

**ÇAŞDIRMAQ** *f.* 1. Müxtəlif yollarla birisinin çaşmasına, çaşıb-qalmasına, özünü itirməsinə səbəb olmaq. *Lakin gözlənilmədən verilən tutarlı suallar* [Verdiyevi] *çaşdırdı.* Mir Cəlal. *Hadisə Qadiri elə çaşdırmış, ruhunu və qəlbini elə sıxmışdı ki, elə bil o gözəl qıza olan hissi və duyğuları da indi onun yadından çıxmışdı.* Ə.Əbülhəsən.

2. Heyrətləndirmək, təəccübləndirmək, heyrətə salmaq. *Şərəfoğlunun gözlənilmədən və özü də belə namünasib vaxtda gəlməsi Rüstəm kişini çaşdırmışdı.* M.İbrahimov.

3. *məc.* Yolunu itirmək, yoldan çıxmaq, azmaq. *İnsan oğlu dinc durmadı; Düz yolunu çaşdı yenə.* S.Vurğun. *Okeanın o tayından; Dil verən olmasaydı; Siz belə çaşmazdınız.* B.Vahabzadə. // *məc.* Yanlış yola sövq etmək, düz yoldan sapdırmaq, yolundan azdırmaq. *Yenə bir para ata-analarına lənət olmuşlar başlayıblar millətimizi çaşdırmağa, azdırmağa.* C.Məmmədquluzadə.

**ÇAŞI** *zərf* Çəp, əyri. ◻ **Kiməsə çaşı baxmaq**.

**ÇAŞIB-QALMA** "Çaşıb-qalmaq"dan *f.is.*

**ÇAŞIB-QALMAQ** b a x **çaşmaq** 1 və 2-ci mənalarda. *Qumru bunu eşidər-eşitməz yerindən qopub üzüaşağı dərəyə doğru yüyürdü, lakin dərə içində qız çaşıb-qaldı.* Ə.Məmmədxanlı. [Rəşid:] *Mən hələ özümü toplamamış, yeni bir möcüzədən tamam çaşıb-qaldım.* İ.Hüseynov.

**ÇAŞIR** *is. bot.* Çətirçiçəklilərdən ot bitkisi. *Ballı bacısı oğlu ilə birlikdə kəndin üst tərəfindəki güneylərə gedər, çaşır, mərovca yığardı.* Ə.Vəliyev.

**ÇAŞKA-LOŞKA** *is.* [*rus.* чашка – fincan, лошка – qaşıq] *zar. dan.* Can bir qəlbdə, bir-birinə çox yaxın yoldaşlar haqqında. [Abuzər bəy:] *Elə düz deyirmişlər ki, sən onunla çaşka-loşkasan.* M.Hüseyn.

**ÇAŞQIN** *sif.* Çaşıb qalmış, nə edəcəyini bilməyən, özünü itirmiş. *Çaşqın adam. – Anam çaşqın* (z.) *bir hal ilə dedi..* S.S.Axundov. *Odunçuoğlu çaşqın bir halda dayanıb durdu.* Ə.Məmmədxanlı. // Heyrət içində qalmış.

**çaşqın-çaşqın** *zərf* Çaşmış halda, özünü itirmiş halda, heyrət içərisində.

**ÇAŞQINLIQ** *is.* Çaşqın adamın keçirdiyi hal, nə edəcəyini bilməmə, özünü itirmə. *..Çaşqınlıq ikinci bir səhvə səbəb ola bilər.* M.S.Ordubadi. *Doktor hələ də bir az əvvəlki qorxu və çaşqınlıqdan əməlli-başlı ayılıb özünə gəlməmişdi.* M.Rzaquluzadə.

**ÇAŞMA** "Çaşmaq"dan *f.is.*

**ÇAŞMAQ** *f.* 1. Arzu olunmayan, gözlənilməyən və ya çıxış yolu bəlli olmayan bir hadisə qarşısında çaşıb-qalmaq, özünü itirmək, nə edəcəyini bilməmək. // Ümumiyyətlə, çaşıb-qalmaq, özünü itirmək, heyrət içində qalmaq. *Muzdur hələ pulun qədərindən xəbəri olmadıqda, ancaq yüzlükləri sayanda, heyrətə düşüb çaşmışdı.* S.Qənizadə.

2. Yanılmaq, səhv etmək. *Qəmgin, məyus düşmənlərin istədi; Saysın, amma çaşdı, saya bilmədi.* A.Səhhət.

**ÇAŞT** [*fars.*] bax **çeşt**. *Yay mövsümü, hava isti, çaşt çağı; Gün qızdırmış dağı, daşı, torpağı.* A.Səhhət. // Günorta yeməyi. [Ağa Mərdan:] *Mərhəba oğlum, ədəblə adam dünyada həmişə əziz olar. Çaşt yeyibsinizmi?* M.F.Axundzadə.

**ÇAT** *is.* Yarıq, yer qabığında aralanmış nazik yarıq, torpağın yarılmış hissəsi. [Əlahəzrətin] *on beş ilə tikdiyi bu dağılmaz bir qələ zənn etdiyi bina titrəməyə, hələ zəlzələ keçməmiş çat-çat olmağa başlamışdı.* M.İbrahimov.

**ÇATAQ** 1. Bax **çarpaz** 1-ci mənada.

2. *sif.* Yapışıq, qovuşuq; bir-birinə yapışmış (meyvə və s.).

**ÇATAQLAMA** "Çataqlamaq"dan *f.is.*

**ÇATAQLAMAQ** *f.* bax **çarpazlamaq**. // Əl barmaqlarını biri-birinə keçirmək. *Biçinçilər əllərini başları altına çataqlayıb.. uzandılar.* Mir Cəlal. *Bəlkə uyuyanda başının altda; Kiçik əllərini çataqlayırsan.* N.Xəzri.

**ÇATAQLANMA** "Çataqlanmaq"dan *f.is.*

**ÇATAQLANMAQ** bax **çarpazlanmaq** 1-ci mənada. *Ananın əlləri Nərimanın çiynində yox, kürəklərində çataqlanmışdı.* Mir Cəlal.

**ÇATAL** *sif.* 1. İkiyə ayrılmış (budaq və s.). // Bitişik, qovuşuq.

2. İkidişli (yaba və s. alət); ümumiyyətlə, ucu ikiyə ayrılmış; ikibaşlı (hər hansı bir şey). // *is.* Çəngəl (yemək aləti).

3. İkitərəfli. *Çatal qıfil.*

**ÇATALLANMA** "Çatallanmaq"dan *f.is.*

**ÇATALLANMAQ** *f.* Çatal kimi ikiyə ayrılmaq. *İrəlidə yol çatallanmışdır.*

**ÇATDIRILMA** "Çatdırılmaq"dan *f.is.*

**ÇATDIRILMAQ** "Çatdırmaq"dan *məch.* *Məktub vaxtında çatdırıldı. Əmanət sahibinə çatdırıldı.*

**ÇATDIRMA** "Çatdırmaq"dan *f.is.*

**ÇATDIRMAQ** *f.* 1. Hər hansı bir vasitə və yolla yetişdirmək, vardırmaq. *Aparıb yerinə çatdırmaq.* // Göndərilən ünvana, yerə, şəxsə, sahibinə vermək, təslim etmək. *Məktubu sahibinə çatdırmaq.* // Bildirmək, məlumat vermək. *Məlumatı yerlərə vaxtında çatdırmaq lazımdır. Xəbəri tez ona çatdır.*

2. Müəyyən həddə, saya, dərəcəyə gətirib çıxarmaq. *Məbləği 40 minə çatdırmaq. İşçilərin sayını otuza çatdırmaq.*

3. Bir işi vaxtında yerinə yetirmək üçün imkanı olmaq, yetişdirə bilmək; gecikməmək. *Özünü iclasa çatdıra bilmədi. Zorla özümü qatara çatdırdım.*

**ÇATI¹** *is.* Qıldan hörülmüş qalın kəndir. *Örkən, palaz, çatı toxu, ip tovla, yun dara; Təndir qala, bişir çörək, aş, ət, gavur qızı!* M.Ə.Sabir. *Bir axşam varlığa yumub gözünü; Bir qırıq çatıdan asdın özünü.* S.Vurğun.

**ÇATI²** *is.* Binanı örtən kirəmitləri, dəmir lövhələrini saxlamaq üçün müxtəlif materiallardan (ağacdan, taxtadan, dəmirdən) quraşdırılmış maili örtü. *Evin çatısı.* // Bina və s. tikərkən üstündə durub işləmək üçün bir-birinə çatılmış ağac, taxta və ya dəmirdən qurulan dayaq; körpü.

**ÇATIQ** *sif.* Çatılmış, ucları qovuşuq, bir-birilə bitişik. *Göylər də yavaş-yavaş; Açır çatıq qaşını.* R.Rza.

**ÇATIQQAŞ** bax **çatmaqaş(lı)**.

**ÇATILAMA** "Çatılamaq"dan *f.is.*

**ÇATILAMAQ** *f.* Çatı¹ ilə bağlamaq, kəndirlə bağlamaq, sarımaq.

**ÇATILI¹** *sif.* 1. Yüklənmiş, dalına yük çatılmış (heyvan).

2. Cidalanmış.

**ÇATILI²** *sif.* Baş-başa çatılmış.

**ÇATILMA** "Çatılmaq"dan *f.is.*

**ÇATILMAQ** *məch.* 1. Yüklənmək, dalına yük qatılmaq (heyvanın). [Pərinisə ərinə:] *..Eşşəyin üstə yekə-yekə çuvallar çatılmışdı...* C.Məmmədquluzadə. *Qoca kiçik qızı atdan düşürtdü və sonra ata çatılmış* (f.sif.) *iki məfrəşi açıb yerə saldı.* S.S.Axundov.

2. Qalanmaq. *Sağılmışdı sürü, naxır; Çatılmışdı ocaqlar.* A.Şaiq. *Ocaqlar çatıldı, kabablar bişdi; Məclisin ahəngi yenə dəyişdi.* S.Vurğun.

**ÇATILTI** b a x **çatırtı**.

**ÇATIRDAMA** "Çatırdamaq"dan *f.is.*

**ÇATIRDAMAQ** *f.* Çatırtı səsi çıxarmaq; çatıldamaq. *İndi ocaqdakı kömür çatırdayırdı.* Q.İlkin.

**ÇATIRTI** *is.* Taxta, odun kimi bərk şeylər yanarkən çıxan səs; çatıltı. *Aşağıda ocaqlar çatırtı ilə tüstülənirdi.* Q.İlkin.

**ÇATIŞ** *is.* Çatmaq işi, çatma, yetmə.

**ÇATIŞMA** "Çatışmaq"dan *f.is.*

**ÇATIŞMAQ** b a x **çatmaq**[1] 5-ci mənada. *Doğrudan da, Hümmətəlinin nəyi çatışmırdı? Son iki-üç ildə onun qazancı heç kəsinkindən az olmamışdı.* M.Hüseyn. *Elə bil qarajda çox qiymətli bir şey çatışmırdı.* H.Seyidbəyli.

**ÇATLAQ** *is.* Çatlamış, yarıq yer; çat. *Uşaqların marağı daha da artdı və* [Əsədin] *arxasınca gedib yavaşca qapının çatlağından baxmağa başladılar.* B.Talıblı. [Direktor:] *Orada yeraltı çatlaqlar olması mümkündür.* M.İbrahimov. // *sif.* Çatlamış, çatlağı olan. *Çatlaq nimçə. – Qız bir çatlaq stəkanda çay gətirdi..* Çəmənzəminli.

**ÇATLAMA** "Çatlamaq"dan *f.is*.

**ÇATLAMAQ** *f.* 1. Çatıq əmələ gəlmək, çatlaq olmaq, parçalara ayrılmayacaq şəkildə yarılmaq, bütövlüyü pozulmaq. *Həsən çəkməni o biri üzünə çevirdi, üst tərəf də vecdən çıxmışdı, neçə yerdən çatlamışdı.* Çəmənzəminli. *Mollayev limonu o qədər bərkdən qarışdırdı ki, çay qaşığının zərbindən stəkan çatladı.* M.Hüseyn.

2. Bir sıra isimlərdən sonra gətirilərək mürəkkəb fel və müxtəlif ifadələr düzəldilir; məs.: ürəyi çatlamaq, başı çatlamaq, çiçəyi çatlamaq və s. *Dağ başında bir çoban; "Yazıq, zavallı Çolpan; Görsə, ürəyi çatlar"; Deyərək, çəkdi bir car.* M.Müşfiq.

**ÇATLATMA** "Çatlatmaq"dan *f.is.*

**ÇATLATMAQ** *f.* Çatlamasına səbəb olmaq, çatıq əmələ gətirmək, çatlaq hala gətirmək. *Sirkə nə qədər tünd olsa, öz qabını çatladar.* (Ata. sözü).

**ÇATLI** *sif.* Çatığı, çatlağı olan; çatlamış. [Çinaryarpaq ağcaqayının] *yaşlı ağaclarının qabığı tünd-qonur rəngdə olub, azca çatlıdır.* "Elm və həyat".

**ÇATMA**[1] 1. "Çatmaq[1]"dan *f.is.*

2. Ucları ortadan bir-birinə qovuşmuş. *Qızın çatma qaşları vardı. – ..Cahandar ağanın qara sifəti tunc kimi bozardı, iri həbəşi dodaqları titrədi, qalın, qıllı çatma qaşlarının arası düyünləndi.* İ.Şıxlı.

**ÇATMA**[2] "Çatmaq[2]"dan *f.is.*

**ÇATMAQ**[1] *f.* 1. Bir istiqamətdə gedərək nəzərdə tutulan yerə yetişmək; varmaq. *Atlılar hələ dolamaları enməmiş, Məmməd bəylə Kiçikbəyim çaya çatmışdılar.* Çəmənzəminli. [Qərənfil xala] *poçta çatdı, sovqat yeşiyinin üstünü yazdırdı.* Ə.Vəliyev. // Eyni mənada qatar, gəmi, maşın, təyyarə və s. haqqında. *Qatar stansiyaya çatdı. Təyyarə saat 2-də Moskvaya çatır.* // Göndərilən ünvana, yerə, şəxsə, sahibinə yetişmək. *Teleqram sahibinə çatdı. – Əziz, mehribanım, çatdı məktubun; Nə qədər sevindik, bilsən, ürəkdən.* M.Rahim.

2. İrəliyə doğru getməkdə olan bir adamın, maşının və s.-nin ardınca gedərək ona yetişmək, yetmək, özünü ona çatdırmaq. [Yusif:] *Qara kəlin boynuna keçi piyi sürtməklə onun yerişini, gücünü artırmaq olmaz, onun ayağı ilə maşına çatmaq olmaz.* B.Bayramov. // Vaxtında yetişmək, varmaq, özünü çatdırmaq. *Qatara çata bilmədim.*

3. ...yaşa qədər yaşamaq, yetişmək. *Gəlin-gəlin oynayan Pərşan iyirmi bir yaşına çatıb, orta məktəb qurtarmışdı.* M.İbrahimov. [Vahid:] [Anam] *and içib, peyman elədi ki, mən iyirmi beş yaşına çatanda atam barədə hər şeyi mənə açacaqdır..* B.Bayramov.

4. Müəyyən saya, həddə yetişmək. *On üç il bundan irəli evləri yazanda Danabaş kəndinin tüstü çıxanı düz altı yüz əlli ikiyə çatmışdı.* C.Məmmədquluzadə. *..Bəli, dostun qəbri üstə çatdı onun ömrü sona.* B.Vahabzadə.

5. Kifayət etmək, bəs olmaq, yetmək; çatışmaq. *Nadir maşın üstə su qaynatdı, çay dəmlədi və stəkan çatmadığı üçün qonşuya getdi.* B.Talıblı. [Əminə xanım:] *Nə baxırsız? Xoşunuz gəlir, atanızla, babanızla gəlin, yeyin, hamınıza çatar*. Ə.Əbülhəsən.

6. Bir şeyin zamanı gəlmək, gəlib-yetişmək, gəlib-çatmaq. *İllər bir-bir sovuşdu, gəlib çatdım yetmişə, hələ də rast gəlmədim; bir kəs ki, arzusuna doyumunca yetişə.* R.Rza.

7. Qovuşmaq, yetişmək, birləşmək. [Rövşən] *bilmədi nə eləsin, başına nə çarə qılsın. Qız olduğunu da açıb desə, tamam biabır olacaq, öz sevgilisinə çata bilməyəcəkdir.* (Nağıl).

8. Məlum olmaq, qulağa çatmaq, bilinmək. *Verdiyevə bir şey də aydın oldu; deməli, Vahidin məsələsi yuxarılara çatmışdır.* Mir Cəlal.

9. Bərabərləşmək, bərabər olmaq, yetişmək, tay ola bilmək. *Riyaziyyatda heç kəs ona çatmaz.* [Çərkəz:] – *Əyə, tez özünü yetir, deyəsən yaman zırpı balıqdır, gücüm çatmır.* İ.Şıxlı.

10. Əlləri ilə bir şeyin ətrafını tutmaq, qucaqlamaq, qavramaq. [Həkim] *qollarını boynuna çataraq, bərk gərnəşdi.* Mir Cəlal. *Sonra da gövdəsində qollarımı çatmışam; Onu bir ana bilib kölgəsində yatmışam.* Z.Xəlil.

11. Başa düşmək, dərk etmək. *Sözlərdəki məna, səslərdəki titrəyiş isə* [Rüstəmə] *çatmırdı.* M.İbrahimov.

12. Bir sıra isimlərdən sonra gətirilərək mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: dadına çatmaq, gücü çatmaq, başa çatmaq, əl çatmaq, qulağına çatmaq və s.

**ÇATMAQ**[2] *f.* 1. Yükləmək. *Küsülü qardaş, gəl yükü çataq, yenə küsümüz küsü.* (Ata. sözü). *Hər birinə ağır taylar çatdılar; Bizləyə-bizləyə köçə qatdılar.* Q.Zakir.

2. Ocağa, sobaya və s.-yə odun və s. qoyub yandırmaq; qalamaq. *Ocaq çatıldadıqca qığılcımlar ətrafa sıçraşır, yavaş-yavaş köz düşürdü.* İ.Şıxlı. *Olarmı meşədə tonqal çatasan; Gələn yağışadək izi qalmasın?* N.Xəzri.

**ÇATMAQAŞ(LI)** *sif.* Qaşları bitişik olan, qaşları bir-birinə qovuşmuş. *Çatmaqaş oğlan.* – *Səkinə iftixar dolu gözlərlə .. enlikürək, ucaboylu, çatmaqaşlı və qartalgözlü oğlunu süzdü.* M.İbrahimov. *Boz şaldan pencək-şalvar geyinmiş, şirvani çarıqlı, törəboy, çatmaqaş uşaq madyanı bir kənara çəkdi.* Ə.Abasov.

**ÇATMAMAZLIQ** *is.* Nöqsan; çatışmayan şey, cəhət. *Çatmamazlıqları aradan qaldırmaq.*

**ÇAVISTAN** *is. məh.* Qarğı, taxta və s.-dən düzəldilmiş yüngül, kiçik tikili, ev. [Qaçayın] *mənzili subay fəhlələr yaşayan taxta çavıstanlardan birində idi.* Ə.Vəliyev.

**ÇAY**[1] *is.* [*çin.*] 1. Qurudulmuş yarpaqlarından ətirli içki hazırlanan həmişəyaşıl ağac və ya kol. *Çay kolu. Çay plantasiyası.*

2. Həmin bitkinin ətirli içki hazırlamaq üçün xüsusi surətdə qurudulmuş yarpaqları.

3. Həmin yarpaqlardan dəmlənib hazırlanan ətirli içki. *Şirin çay. Tünd çay.* – *Barışdırmaq rəsmini tamam edəndən sonra qonaqlar şüru elədilər çay içməyə.* Ə.Haqverdiyev. *Əsmər xala bir stəkan çay süzüb qabağına qoydu.* Q.İlkin. // Müxtəlif bitkilərdən, ədviyyatdan dəmlənib hazırlanan içki, yaxud çayı əvəz edən hər hansı bir surroqat. *Kəklikotu çayı. Zəncəfil çayı.* – [İbrahim:] *Bala, yoxsa sənə soyuq dəyib, sənin üçün bu saat darçın çayı bişirərəm.* Ə.Haqverdiyev.

4. Çay içmə, çay süfrəsi. *Çaya dəvət etmək.* – *Çaydan sonra Nənəxanım Yetərlə çarşaba bürünüb, qız axtarmağa getdilər.* Çəmənzəminli. *Bir yerdə çay içdik, çaydan sonra mən yatdım.* Ə.Haqverdiyev.

**ÇAY**[2] *is.* Öz hövzələrinə düşən atmosfer yağıntılarından və ya bulaqlardan qidalanan və özü əmələ gətirdiyi yataqla axan çoxlu və fasiləsiz təbii su axını. *Çayın sahili. Çayla başıaşağı üzmək. Çay üzərində körpü.* – *Hindistanda Qanq çayı bizim Kür çayından çox böyükdür.* C.Məmmədquluzadə.

◊ **Çay gəlməmiş (çaya çatmamış) çırmanmaq (soyunmaq)** – vaxtından çox qabaq bir işi görməyə hazırlanmaq, tələsmək. *Gözümüz o qədər qorxudulub ki; "Hələ çay gəlməmiş çırmanmışıq biz".* B.Vahabzadə. **Çaya susuz aparıb, susuz gətirmək** – çox hiyləgər, bic, zirək adam haqqında. **Çayda balıq sövdası** – həyata keçməsi qeyri-mümkün və ya şübhəli olan bir şey haqqında. **...çayda üzüaşağı (çayaşağı) axıdım, üzüyuxarı (çayyuxarı) axtarım** – qarğış və ya istehza ifadəsi. [Xırdaxanım:] *Sənin kimi kişini çayaşağı axıdım, çayyuxarı axtarım..* N.Vəzirov. [Telli Yazgülə:] *Elə alimi çayda üzüaşağı axıdıb, üzüyuxarı axtarım.* Ə.Məmmədxanlı.

**ÇAYAN** *is.* Əqrəb.

**ÇAYAŞAĞI** *zərf* Çayın başlanğıcından ağzı istiqamətində, suyun axıb getdiyi tərəfə; çayla başıaşağı. *Çayaşağı üzmək.* – [Nurəddin] *paltarı quruyandan sonra geyinib çayaşağı xeyli getdi ki, bəlkə papağını tapsın.* S.S.Axundov. [Allahyar] *atını sürüb çayaşağı uzaqlara getdi.* İ.Şıxlı.

**ÇAYBASAR** *is.* Çayın sahilində daşqın zamanı su altında qalan sahə (yerlər).

**ÇAYBECƏRƏN** b a x **çayçı** 1-ci mənada.

**ÇAYÇI** *is.* 1. Çay əkib-becərməklə məşğul olan adam; çaybecərən. *Çayçıların yarışı.* // Çay mütəxəssisi.

2. Çayxanada xidmət edən adam. *İri mis samovarın qabağında duran çayçı stəkan-nəlbəkini cingilti ilə yuyurdu.* Q.İlkin. // Keçmişdə: çay qoyub satan adam, çayxanaçı.

3. Çayçı dükanı, çayxana. *İkinci gün Məhərrəm çayçıya gedərkən yolda həmin müsafir barədə fikirləşirdi.* H.Nəzərli. *Utansın çayçıda tər axıdanlar; Tarlada tər tökən qızlarımızdan.* N.Xəzri.

**ÇAYÇIXANA** b a x **çayxana**. *Məşədi Məmməd gündüzlər bazar-dükanı dolanıb, çayçıxanaları gəzərdi.* B.Talıblı.

**ÇAYÇILIQ** *is.* 1. Çay bitkisi əkib-becərməklə məşğul olan kənd təsərrüfatı sahəsi. *Çayçılığın inkişafı seyrəkliyin ləğv edilməsindən, istehsal fondlarından, aqrotexniki tədbirlərdən .. asılıdır.*

2. Çayxanada müştərilərə çay satmaqla məşğul olma. // Keçmişdə: bir peşə kimi çay qoyub müştərilərə satmaqla məşğul olma. [Mirzə Heydər] *..İsfahanda çayçılıq edirdi.* Qantəmir. *Əhalinin bir qismi də xırda ticarətlə – çayçılıq, kababçılıq, həlimaşıçılıq, bəzzazlıqla məşğul olardı.* H.Sarabski.

**ÇAY-ÇÖRƏK** *top*. Çay, çörək, yağ, pendir və s.-dən ibarət yemək. *Bu halda Cəfər əlində podnos, içində çay-çörək, şora batırılmış təzə inək yağı içəri daxil oldu.* S.S.Axundov. *Tükəzban qarı çayı-çörəyi gətirib, .. yemək masasının üstünə qoyanda Lalə də özünü səliqəyə salıb gəldi.* M.Hüseyn.

**ÇAYDAN** [*çin*. çay və *fars.* ...dan] 1. B a x **çayqabı**.

2. Bax **çaynik**. *Piri kişi .. çaydandan iki fincan çay töküb süfrəyə qoydu.* S.S.Axundov. *Nigar pilətəni yandırıb, çaydanı üzərinə qoydu..* Çəmənzəminli.

**ÇAYDAŞI** *is.* Axar suyun təsirindən hamarlanıb yuvarlanmış xırda daş; çaylaq daşı, qənbər. *Yol boyu arabaların silkələyib yorduğu uşaqlar sevinə-sevinə qaçışmağa, yumru qara çaydaşları ilə camışları yalamalamağa başladılar.* İ.Şıxlı.

**ÇAYƏTRAFI** *sif.* Çayın sahilində olan; çayyanı; çaykənarı. *Dağlıq və dağətəyi rayonlarda tütün əkini sahəsini artırmaq üçün əsas ehtiyat mənbələrindən biri də çayətrafı sahələrdən səmərəli istifadə edilməsidir.* "Elm və həyat".

**ÇAYXANA** *is.* [*çin.* çay və *fars.* ...xanə] Əsasən çay içilən ictimai iaşə müəssisəsi; çayçı, çayçıxana. [Əbdül:] *Yorulmuşdum, döndüm çayxanaya ki, bir-iki fincan qəhvə içim.* Ə.Haqverdiyev. [Rüstəm] *lakin qərarı yerinə yetirməmiş çayxanaya girib iki stəkan tünd çay içdi.* M.İbrahimov.

**ÇAYXƏRÇƏNGİ** *is. zool.* Şirin sularda yaşayan xərçəng növü.

**ÇAYXOR** *sif.* [*çin.* çay və *fars.* ...xor] Çox çay içən, çox çay içməyi sevən adam. *Çayxor adam.*

**ÇAYIR** *is.* 1. *bot.* Taxıllar fəsiləsindən kökümsovlu alaq otu. *Belin ağzı saralmış çayırları xırpıltı ilə kəsə-kəsə yekə bir dairə cızdı.* İ.Məlikzadə.

2. Çəmən. [Çinarların] *arasından çıxan sərin çeşmə yol açdığı kiçik çınqıl daşların üzərindən xoşahəngli bir şırıltı ilə böyük çayırlara doğru axıb gedirdi.* A.Şaiq. *Dolanaq çayırı, gəzək çəməni.* M.Rahim.

**ÇAYIR-ÇƏMƏN** *is.* Çəmən, çəmənlik. *İçib sudan pərvazlandı çayır-çəmən; Gözəlləşdi kənd yenidən.* B.Vahabzadə.

**ÇAYIRLIQ** *is.* Çoxlu çayır bitmiş, çayır basmış yer. [Heybət] *..vədinə vəfa edib, axşam düşənə kimi iki parça yeri şumladı, çayırlığa yetişdi.* M.Hüseyn. [Gülşən:] *Çayırlıqların hamısını iki dəfə belləməliyik.* Ə.Vəliyev.

**ÇAYQABI** *is.* Quru çayı saxlamaq üçün qab, qutu; çaydan.

**ÇAYQIRAĞI** 1. *sif.* Çayın sahilində olan, yaşayan. [Həsrət Yusifə:] *Xaçının sizin tərəf-*

*lərdə dəryaça edilməsi .. bütün çayqırağı camaatının böyük xoşbəxtliyidir.* B.Bayramov.

2. *zərf* Çayın qırağı ilə, sahili ilə. *Çayqırağı getmək.*

**ÇAYQOVUŞAN** *is.* İki çayın qovuşduğu, birləşdiyi yer. [Aşıq Valeh] *çayqovuşana çatanda yoldan buruldu.* Ə.Məmmədxanlı.

**ÇAYLAQ** *is.* Quru çay yatağı. *Xınalıqdan Şah dağına getmək üçün əvvəlcə çaylağa enməli olursan.* R.Rza. [Döyüşçülər] *bir az yoxuşla dırmaşdıqdan sonra enişə, həm də çaylağa endilər.* Ə.Vəliyev. ☐ **Çaylaq daşı** – b a x **çaydaşı**. *Yolun o əl-bu əlində yuyulub təmizlənmiş muncuq kimi gözəl çaylaq daşları parıldayır, tez-tez təkərlərin ağzından qoparaq çırtaçırtla dörd yana səpələnir.* M.İbrahimov. *Çaylaq daşından tikilmiş* [Xınalıq kəndinin] *evləri, torpaq eyvanları, səkiləri, ağacsız dar küçələri elə bil çiçəklərlə, güllərlə bəzənmişdi.* R.Rza.

**ÇAYLAMA** "Çaylamaq"dan *f.is.*

**ÇAYLAMAQ** *f. dan.* Çay içmək.

**ÇAYNİK** *is.* [*çin.* çay və *rus.* ...nik] Çay dəmləmək və ya su qaynatmaq üçün dəstəsi və lüləyi olan qab. *Elektrik çayniki. – Ənvər bərk susamışdı, bir stəkan çay içmək üçün samovarın başından çayniki götürdü.* Ə.Vəliyev. *Tükəzban xala çayı dəmləyəndən sonra .. çayniki dəsmalla bürüyüb dəmə qoydu.* İ.Şıxlı.

**ÇAYPULU** *is.* Aşxanaya və s.-yə gələnlərin xırda xidmət üçün xidmətçiyə verdikləri pul.

**ÇAYSÜNGƏRİ** *is. zool.* Şirin sularda yaşayan süngər.

**ÇAYSÜZƏN** *is.* Dəm çaynikindən rəng tökərkən çay dənələrinin stəkana düşməməsi üçün onun lüləyinin ağzına keçirilən və ya stəkanın ağzına qoyulan tor.

**ÇAYTİKANI** *is. bot.* b a x **ağtikan**. *Ağtikan və ya çaytikanı .. cinsinin yarpaqları ensiz olub, iydə yarpaqlarına oxşayır.* M.Qasımov.

**ÇAYYIĞAN** *is.* Tarlada çay yarpaqları yığan, dərən (adam və ya maşın). *Qabaqcıl çayyığanlar.* // Sif. mənasında. *Yenimarkalı çayyığan maşın.*

**ÇAYYUXARI** *zərf* Çayın ağzından başlanğıcı istiqamətində, suyun axdığı tərəfin əksinə, çayla başıyuxarı. *Çayyuxarı üzmək. – Yelkən çayyuxarı o qədər də böyük sürətlə getmirdi.* M.S.Ordubadi. [Uşaqların] *gülüşü, hay-harayı dalğa-dalğa olub çayyuxarı yayıldı, dərəni doldurdu.* İ.Şıxlı.

**ÇE** "Ç" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**ÇEÇEN** *is.* İnquşlara qohum olan Qafqaz xalqı və bu xalqa mənsub adam.

**ÇEÇENCƏ** *sif.* və *zərf* Çeçen dilində. *Çeçencə-rusca lüğət.*

**ÇEÇƏLƏ: çeçələ barmaq** – əlin beşinci, ən kiçik barmağı. [Musanın nəvəsinin] *çeçələ barmaqlarındakı dırnağının uzunluğu 9 millimetr yarımdır.* Qantəmir. [Firəngiz] *kağız qoyduğu yeri çeçələ barmağı ilə araladı.* B.Bayramov.

**ÇEÇƏMƏ** "Çeçəmək"dən *f.is.*

**ÇEÇƏMƏK** *f.* Nəfəs borusuna bir şey düşməsi nəticəsində təngnəfəs olmaq; anən boğulmaq. *Tahir çeçədi. Ağız-burnuna dolmuş acı su ürəyini bulandırırdı.* M.Hüseyn. *Veys hətta bir dəfə çeçədi.* Ə.Əbülhəsən.

**ÇEX** *is.* Slavyan xalqlarından birinin adı və bu xalqa mənsub olan adam.

**ÇEXCƏ** *sif.* və *zərf* 1. Çex dili. *Çexcə-rusca lüğət.*

2. Çex dilində. *Çexcə gözəl bilir. Çexcə yazılmış kitab.*

**ÇEXOXBİLİ** *is.* [*gürcü.*] *aşp.* Gürcü yeməyi; toyuq ətindən xamalı və qozlu bozartma. [Xortdan:] *Tiflisdə .. çığırtmanın adını çexoxbili qoyub, gətirib verirlər adama.* Ə.Haqverdiyev.

**ÇEXÓL** [*rus.*] Hər hansı bir şeyi xarab olmaqdan, çirklənməkdən qorumaq üçün parça və ya başqa materialdan onun formasında hazırlanan örtük; qın. *Maşının çexolu. Brezent çexol. –* [Oğlan] *çamadanı da çexola salıb düymələdi.* Mir Cəlal.

**ÇEXOLLU** *sif.* Çexolu olan, çexol geydirilmiş, çexola salınmış. *Əntərzadə çexollu çamadanı götürüb, qapıya çıxdı.* Mir Cəlal.

**ÇEK** [*ing.*] 1. Təqdim edənə cari hesabdan müəyyən miqdarda pul verilməsi və ya onun hesabına keçirilməsi haqqında pul sahibinin sərəncamı olan sənəd. *Rəhim bəy çeki* [Turabın] *əlindən dartıb aldı. Qol çəkdi.* M.Hüseyn. [Salmanov:] *Çekləri, möhürü*

*götürdüm, axtardım, bəlkə cibində nağd pulu var.* S.Rəhman.

2. Üzərində alınan mal üçün kassaya ödəniləcək məbləğ göstərilən və ya alınan mal üçün pulun kassaya ödənildiyini təsdiq edən sənəd; qəbz. *Satıcıya çek yazdırmaq.*

**ÇEKÁ** [baş hərflərlə] [*rus. Чрезвычайная комиссия по борьбе с контрреволюцией, саботажем и спекуляцией*-in ixtisarı] Sovet hakimiyyətinin ilk illərində əks-inqilab, sabotaj və ehtikarla mübarizə aparan fövqəladə komissiya (idarə adı).

**ÇEKÍST** *is.* [*rus.*] ÇEKA əməkdaşı (b a x **ÇEKA**).

**ÇEMPİÓN** *is.* [*ing.*] İdman yarışlarında qələbə qazanan komandaya və ya şəxsə verilən ad. *Şahmat üzrə dünya çempionu. Mütləq çempion. Azərbaycan çempionu.*

**ÇEMPİONÁT** *is.* [*ing.*] Hər hansı idman növü, idman oyunları üzrə birincilik uğrunda yarış, yarışma. *Futbol çempionatı. Boks üzrə dünya çempionatı. Respublika çempionatı.*

**ÇEMPİONLUQ** *is.* Çempion adı.

**ÇERTYÓJ** *is.* [*rus.*] Bir şeyin müəyyən üsullarla səth (kağız, kalka, taxta və s.) üzərində çəkilmiş şərti qrafik təsviri; cizgi. *Layihənin çertyoju. Binanın çertyoju. – Lətif ona tapşırılan detalın çertyojunu alıb, böyük həvəslə işə başladı.* H.Seyidbəyli.

**ÇERTYOJÇU** *is.* Çertyoj çəkən mütəxəssis; cizgiçi. *Laboratoriyada 17 işçi, o cümlədən iki konstruktor, çertyojçu, tokar, çilingər və başqa ixtisaslı fəhlə işləyir.* (Qəzetlərdən).

**ÇERVÓN** *is.* [*rus.* червонец] *köhn.* 1. Keçmişdə: Rusiyada beş və ya on manatlıq qızıl pul. *Mirzə Mustafa qarını yola salanda ovcuna bir çervon basdı..* E.Sultanov.

2. *tar.* SSRİ-də 1922-ci ildən 1947-ci ilə qədər işlənmiş onmanatlıq kağız pul.

**ÇESUÇÁ** [*çin.*] Kətan kimi toxunan sıx ipək parça. *Çində vəhşi ipəkqurdlarının baramalarından "çesuça" adlı toxumalar hazırlayırlar.* "Əmtəəşünaslıq". // Bu parçadan tikilmiş. *Cavanların arasından çesuça kostyumla lak çəkmə geyinmiş, saçlı, tökmərək bir oğlan çıxıb irəli gəldi..* Ə.Əbülhəsən.

**ÇEŞİD** *is.* 1. Hər hansı bir malın keyfiyyət və qiymətcə növü, sort. *İkinci çeşiddən olan un. Parçanın çeşidi.* // İstehsalına, materialına və c.-yə görə malın müxtəlifliyi; növ. *Parçanın çeşidləri.* – [Qızlar] *iki-iki, üç-üç və daha artıq çoxluğu olan kiçik dəstələrlə böyük dəzgahlar qarşısında əyləşib bütün gün axşamacan çeşidli fərşlər toxuyurdular.* Ə.Məmmədxanlı.

2. *məc.* Cür, növ. [Nüşabə:] *Durmayın, şahanə bir süfrə açın! Ortaya hər çeşid naz-nemət saçın!* A.Şaiq. *Hansı saya, hesaba gələr insan dərdinin insan arzusunun çeşidi.* R.Rza.

**ÇEŞİDLƏMƏ** "Çeşidləmək"dən *f.is.*

**ÇEŞİDLƏMƏK** *f.* Çeşidlərə, növlərə ayırmaq. *Kartofu çeşidləmək.*

**ÇEŞİDLƏNMƏ** "Çeşidlənmək"dən *f.is.*

**ÇEŞİDLƏNMƏK** *məch*. Çeşidlərə, növlərə ayrılmaq. *Toxum döyülən və çeşidlənən* (f.sif.) *zaman əmələ gələn çıxdaşdan yem kimi istifadə edilməlidir.* "Pambıqçılıq".

**ÇEŞİDLƏYİCİ** *is.* və *sif.* Bir şeyi çeşidlərə ayıran işçi; çeşidçi. // Eyni vəzifəni görən maşın, cihaz, mexanizm.

**ÇEŞİDLİ** *sif.* Müxtəlif növlü, cürbəcür, növ-növ. [Aşpaz] *işindən söz açdı: ..gözəl və səliqəli yeməkxana, dadlı və çeşidli xörəklər...* "Az. qad".

**ÇEŞM** *is.* [*fars.*] *klas*. Göz. *Gecə-gündüz vaxt-bivaxt ağlaram: Çeşmim yaşı Ceyhun olur, sellənir.* Qurbani. [Abbas:] *Gül rüxsarın əhsən deyib bülbülə; O çeşmi-xumarın yadıma düşdü.* "Abbas və Gülgəz".

**ÇEŞMƏ** *is.* [*fars.*] 1. Yerin altından sızıb çıxan su mənbəyi; bulaq, qaynaq. [Çinarların] *arasından çıxan sərin çeşmə çınqıl daşların üzərindən xoşahəngli bir şırıltı ilə böyük çaylara doğru axıb gedirdi.* A.Şaiq. *Sərin çeşmələrin qaynayır gözü; Yenə dinləyirəm aram-aram mən.* N.Xəzri.

2. Məc. mənada. *Ey insan! Ürəyin qədrini bil ki; Həyat çeşməsidir o müqəddəs su.* S.Vurğun.

◊ **Göz çeşməsi** – gözün yaş çıxan yeri, buruna tərəf olan yeri. [Cavad] *çox kövrəlmişdi, lakin özünü toxtatdı, gözlərinin çeşməsinə yığılan yaşı ürəyinə səpib həyəcanını söndürdü..* Ə.Vəliyev.

**ÇEŞMƏK** *is.* [*fars.*] Gözlük, eynək. *Mürgüləyir nənəm taxıb çeşməyi; Düşüb yerə toxuduğu əlcəyi.* A.Səhhət. *Nə barədə? – deyə*

*Yarməmməd birbaşa cavab verməyib, çeşməyinin altından Şirzada baxdı.* M.İbrahimov.

**ÇEŞMƏKÇİ** *is.* Çeşmək ustası.

**ÇEŞMƏKLİ** *sif.* Çeşmək taxmış, gözündə çeşmək olan; gözlüklü, eynəkli. *Ucaboylu, uzunboğaz çəkməli, .. çeşməkli mühasib içəriyə girərək əmrə müntəzir kimi durdu.* S.Rəhimov. *Çayxananın dib tərəfində oturmuş çeşməkli oğlan Xalıqverdiyə xüsusi nəzər saldı.* Ə.Vəliyev.

**ÇEŞMƏLİ** *sif.* Çeşmələr, ya çeşmə olan; bulaqlı. *Çeşməli meşə. – Sevirəm çeşməli, sulu dağları; Vüqarlı dağları, ulu dağları.* N.Xəzri.

**ÇEŞNİ** *is.* [*fars.*] 1. Şəkil, forma. *Papaqların bəzisi uzun qovun çeşnisində idi, bunların sahibinin molla və əyandan olmağı aşkar idi.* Çəmənzəminli. // Naxış. [Çopo] *evə baxdıqdan sonra Mimrə daşın üzərindəki çeşnini göstərdi.* Çəmənzəminli. *..Karxananın qoca nəqqaşı hazırladığı müxtəlif çeşnilər içərisində qızıl qönçələr olan nəqşləri həmişə Süreyya üçün nəzərdə tutardı.* Ə.Məmmədxanlı. // Əndazə, nümunə, trafaret. *Xalının rəngi, çeşnisi, nəqşi tərifə layiq idi.* Ə.Vəliyev.

2. Layihə. [Rəis:] *Yemək evinin çeşnisini Mimrəyə tapşırmalı.* Çəmənzəminli.

3. *məc*. Tərz, üsul. *Axırkı sözləri Cəfər bir elə çeşni ilə dedi ki, xoşum gəldi..* E.Sultanov.

**ÇEŞNİLİ** *sif.* Müəyyən çeşnidə, üslubda olan; ...naxışlı. *Biz məşhur Qonaqkənd çeşnili və Xınalığın özünə məxsus çeşni ilə toxunmuş xalçaları da gördük, onları toxuyan qadınların adını eşitdik.* R.Rza.

**ÇEŞT** *is. məh*. Səhərlə günorta arasında olan vaxt, saat 10-11 radələri. *Sən çeştədək yatırsan; Pal-paltarın atırsan.* A.Səhhət. *Axşamdan yıxılır, çeştəcən yatır: Həftədə hanaya bir arğac atır.* Aşıq Ələsgər. ☐ **Gün çeştə (çeşt yerinə) qalxanda (qalxınca)** – çeşt vaxtı, çeşt. *Gecə uzunu yol gələn Vahidov gün çeşt yerinə qalxınca evinə döndü.* S.Rəhimov. *Gün çeştə qalxanda köhnə bir yük maşını Şahmarın qabağında dayandı.* B.Bayramov.

**ÇEVİK** *sif.* və *zərf* 1. Hərəkətində, davranışında çox cəld olan; diribaş, zirək, qıvraq. *Nurəddin özünə görə bilikli, çevik bir uşaqdır.* S.S.Axundov. *..Yurdun çevik, qıvraq qızları, oğlanları halay vurub yallı gedir, onlar da quşlar kimi səs-səsə verib günəşi, baharı, quşları salamlayırdılar..* M.Rzaquluzadə.

2. Yeyin, iti, cəld. *Usta çevik addımlarla perrona çıxdı.* M.Hüseyn. [Oğlanın] *hərəkətləri cəld və çevikdir.* S.Rəhman.

**ÇEVİKCƏ** *zərf* Çevik bir tərzdə; cəld, iti. *Çevikcə otaqdan çıxmaq.*

**ÇEVİKLƏŞMƏ** "Çevikləşmək"dən *f.is.*

**ÇEVİKLƏŞMƏK** *f.* Çevik olmaq, qıvraqlaşmaq, zirəkləşmək. *Uşaq böyümüş, rəngi açılmış, dirçəlmiş, çevikləşmişdi.* Mir Cəlal.

**ÇEVİKLİK** *is.* 1. Hərəkətdə, davranışda cəldlik; zirəklik, diribaşlıq, bacarıqlılıq, qıvraqlıq. [Buğac] *öz gücünü, çevikliyini, bədəninin dözümünü sınayırdı.* M.Rzaquluzadə.

2. Yeyinlik, itilik, cəldlik, cəld və asanlıqla hərəkət etmə qabiliyyəti; çevik hərəkət. *Bütün şəhərdəki qız-gəlinin Xosrovun bu çevikliyindən danışmağı nə isə Rüxsarəyə xoş bir təsir bağışlayırdı.* S.Rəhimov. *..Cumanın indi qırx yaşı vardı, gözündə qabaqkı kəskinlik, qolunda, qıçında qabaqkı çeviklik qalmamışdı.* Ə.Əbülhəsən.

**ÇEVİRMƏK** *f.* 1. İstiqaməti dəyişdirmək, başqa tərəfə yönəltmək. *Dalını çevirmək. Üzünü bizə çevir. – Yaşar tüfəngi çəpişə sarı çevirib, nişan almağı təcrübə etdi.* M.Rzaquluzadə.

2. Bir şeyin vəziyyətini, yerini dəyişmək; döndərmək. *Mən .. başladım malları sürməyi, dadaşım da ətəyi ilə alnının tərini silib, şananı götürdü və başladı küləşi çevirməyə.* C.Məmmədquluzadə. // Başıaşağı qoymaq, döndərmək. *Stəkanı çevirmək. – Sadıq torbanı ağzıüstə mis məcməyinin içi-nə çevirdi.* Mir Cəlal. [Qərənfil xala] *dəmkeşi üzüqoylu qazanın ağzına çevirdi.* Ə.Vəliyev.

3. Vərəqləmək. *Müşkünaz oturdu. Açıq kitabın vərəqini çevirdi.* Ə.Vəliyev. *İndi görək şairin özü nə deyir, – deyə; Başladı asta-asta divanı çevirməyə.* B.Vahabzadə.

4. Bir şeyi başqa bir vəziyyətə salmaq, başqa bir şeyə döndərmək, ona tamamilə başqa bir görünüş vermək. *Görünür, bura bir zaman tövlə olmuşdu. Sonra çevirmişdilər.* M.İbrahimov. *Alovun saçdığı işıq gecəni gündüzə çevirmişdi.* Ə.Vəliyev.

5. Tərcümə etmək. *Farscadan azərbaycancaya çevirmək. – Rusiya şerinin şah əsərini; Çevirdim Vaqifin şirin dilinə!* S.Vurğun.

6. *dan.* Şumlamaq, təpmək, belləmək. *Qoş kotanı, çevirgilən düzləri; Günlüyün birindən bir anbar olsun.* Aşıq Ələsgər.

◊ **Çevir tatı, vur tatı** – bir şeyi ardı-arası kəsilmədən bıqdıracaq dərəcədə təkrar etmə mənasında. [Xaspolad:] *Görmürsən, Oqtay, keçən qış bir söz demişəm, hələ çevir tatı, vur tatı.* C.Cabbarlı. *Xəlilov bir neçə dəqiqə də çevir tatı, vur tatı eləyib, cavab almadan qapını çırparaq getdi.* M.Hüseyn.

**ÇEVİRTMƏ** "Çevirtmək"dən *f.is.*

**ÇEVİRTMƏK** "Çevirmək"dən *icb.*

**ÇEVRƏ** *is.* 1. Mərkəzdən eyni məsafədə olan qapalı əyri xətt. *Pərgarla çevrə çəkmək.* // Bir şeyin kənarlarında əmələ gətirdiyi qapalı xətt; dövrələmə xətt. *Bu sahənin çevrəsi beş yüz metrdir.*

2. Ətraf, yan-yörə, dörd tərəf, həndəvər, dövrə. *Açılıb cənnət tək camalın gülü; Ötər çevrəsində şeyda bülbülü.* M.V.Vidadi. *Yalnız ağac baxır bir dağ başından; Sarmış çevrəsini inadlı bir çən.* M.Müşfiq.

**ÇEVRƏLƏMƏ** "Çevrələmək"dən *f.is.*

**ÇEVRƏLƏMƏK** *f.* Ətrafını sarmaq, əhatə etmək, dövrələmək, qaplamaq. *Xalq meydanı çevrələyib gözləyirdi.* Çəmənzəminli.

**ÇEVRƏLƏNMƏ** "Çevrələnmək"dən *f.is.*

**ÇEVRƏLƏNMƏK** *məch.* Əhatə edilmək, əhatələnmək, ətrafı sarılmaq, dövrələnmək.

**ÇEVRİKMƏ** "Çevrikmək"dən *f.is.*

**ÇEVRİKMƏK** *dan.* b a x **çevrilmək** 4-cü mənada. [Rəşid:] *Mən bir neçə dəfə yerimin içində çevrikdim.* İ.Hüseynov.

**ÇEVRİLİŞ** *is.* 1. Bir şeyin inkişafında kəskin dönüş, köklü dəyişiklik. *Elmdə çevriliş.*

2. Mövcud ictimai-siyasi sistemdə əsaslı dəyişiklik. *Dövlət çevrilişi. Siyasi çevriliş.*

**ÇEVRİLMƏ** "Çevrilmək"dən *f.is.*

**ÇEVRİLMƏK** 1. *məch.* Başqa hala salınmaq, başqa şəklə salınmaq, döndərilmək. *O başını yellədib bir ah çəkdi dərindən, "Ah" alova çevrilib saçıldı gözlərindən.* B.Vahabzadə.

2. *t-siz*. Tez-tez bir haldan başqa hala keçmək. *Su donaraq buza çevrilmişdir. – Radium parçalanaraq axırda qurğuşuna çevrilir.* "Günəşin tarixi". // *məc.* Dönüb başqa bir şey olmaq, başqa keyfiyyət almaq, başqa bir şeylə əvəz olunmaq. *Bulağa gəlirkən* [Zöhrədə] *olan nəşə indi tamamilə kədərə çevrilmişdi.* Ə.Vəliyev. *Bir anda Sonanın halı dəyişdi, həsrət və məhəbbət qəribə bir marağa və şübhəyə çevrildi.* M.İbrahimov.

3. *məch.* İstiqamətləndirilmək, yönəldilmək. *Pulemyotlar düşmənə tərəf çevrildi. – Toplara bax, toplara, tanklara bax, tanklara; Od saçan lülələri çevrilibdir gör hara?* B.Vahabzadə.

4. *f.* Dönmək, devrilmək. *Arvad qışqırdı, uşaqlar çığırışdılar, məcməyi üzüqoylu çevrilib, dolmanın hərəsi evin bir küncünə diyirləndi.* Çəmənzəminli. *Səs-küy artdı, ara qarışdı, üstü içki və yeməklə dolu stollar çevrilib alt-üst oldu.* S.Vəliyev.

5. *f.* Özünü çevirmək, özünü döndərmək, dönmək. *Tərlan yatağında tez-tez o yan-bu yana çevrilir, yata bilmirdi.* M.Hüseyn. *Midhəd gözlərini açdı, təyyarənin böyrü üstə çevrildiyini ani olaraq duydu.* Ə.Vəliyev. // Üzünü, ya bədənini döndərmək, başqa səmtə döndərmək, dönmək. *Faytonçu çevrilib Qəhrəmana baxdı.* S.Rəhimov. *Ayna çevrilib geri baxdı.* Ə.Məmmədxanlı.

6. *məch.* Şumlanmaq, sürülmək, bellənmək, təpilmək. *Meynəlik çevrilib qurtarmışdır. – Torpaq çevrilmək, nəfəs almaq istəyir.* Ə.Vəliyev.

7. *məch*. Tərcümə olunmaq. *Əsər bir neçə dilə çevrilmişdir.*

**ÇEVRİM** *sif.* Çevrilmiş; çevrilmiş halda, çevrilmiş şəkildə olan. [Hücrədə] *qararəngli, qıvrımtüklü və dodaqları çevrim uşaqlar var idi.* M.S.Ordubadi.

**ÇEYNƏM** *is.* 1. Çeynəmək işi, çeynəmə.

2. Ağızda çeynənəcək miqdar (adətən rəqəmlə). *Bir çeynəm saqqızın var, çeynə, yapışdır alnına.* (Ata. sözü).

**ÇEYNƏMƏ** "Çeynəmək"dən *f.is.*

**ÇEYNƏMƏK** *f.* 1. Ağıza qoyulan bir şeyi dişlə qırmaq, əzmək, xırdalamaq, ovmaq. *Ağzımda çörəyi çeynəyib bəzən; Xırdacaxırdaca yemlərdim onu.* S.Vurğun. *Beşi də böyrünü yerə vermiş, yenicə bitmiş qırxbuğumludan qıraraq ağızlarına qoyur və çeynəyirdilər.* Ə.Vəliyev. // Dişləri ilə kəsmək, gəmirib qırmaq. *Hər yerdən ümidini kəsmiş*

*Məhbusi ipini çeynəyərək qolunun birini açmışdı.* M.İbrahimov. // Hirs, qəzəb, acıq ifadəsi olaraq dodaqlarını, bığlarını dişləri arasına alıb əzmək, gəmirmək. [Ağası bəy] *əllərini döşünə qoyub bığlarını çeynəyən* (f.sif.) *xanın buyruğuna müntəzir idi.* Çəmənzəminli. *Acıqdan çeynədi dil-dodağını; Kinindən yeyirdi ürək yağını.* A.Şaiq.

2. *məc*. Bir sözü çox təkrar etmək; təkrarlamaq, bayağılaşdırmaq. *Axşamacan hamı bu sözləri ağzında çeynəyirdi və çeynəyib özgəsinə verirdi.* B.Talıblı.

3. *məc*. Tapdalamaq, ayaqlar altına salmaq. [Xəyyam:] *Çeynədik yıpramış adətləri biz; Böylə azadə ömür sürmədəyiz.* H.Cavid.

**ÇEYNƏNMƏ** "Çeynənmək"dən *f.is.*

**ÇEYNƏNMƏK** *məch*. 1. Yeyilən şey ağızda dişlər altında əzilmək, gəmirilmək, dişləm-dişləm edilmək. *Yemək çeynəndikdən sonra udulur.*

2. *məc*. Çox-çox təkrar edilərək bayağılaşdırılmaq, həddindən artıq təkrar edilmək.

3. *məc*. Ayaqlar altına salınmaq, tapdalanmaq, təzyiq altına alınmaq, zülm edilmək. *Dumalar padşaha nökərdir yalnız; Yenə də çeynənir bizim haqqımız.* S.Vurğun.

**ÇEYNƏNMİŞ** *f.sif.* 1. Ağızda, diş altında əzilmiş, gəmirilmiş, dişləm-dişləm edilmiş. *Çeynənmiş ət.*

2. *məc*. Çox təkrar edilərək bayağılaşdırılmış, bıqdıracaq dərəcədə təkrarlanmış. *Çeynənmiş fikirlər.* – [Firəngiz Muxtara:] *Bunlar çeynənmiş, cəfəng sözlərdir.* B.Bayramov.

3. *məc*. Tapdalanmış, ayaqlar altına salınmış. *Çeynənmiş hüquqlar.*

**ÇEZMƏK** *f.* Gəbərmək, murdar olmaq.

**ÇƏHRAYI** *sif.* Açıq-qırmızı, qızılgül rəngli. *Çəhrayı parça. Çəhrayı paltar. Çəhrayı qərənfil. – Qızın çəhrayı üzü pul kimi qızardı.* M.Hüseyn. *Arvadın əynində çəhrayı ipək kofta, başında da güllü haşiyəli kəlağayı vardı.* H.Seyidbəyli.

**ÇƏHRAYILAŞDIRMA** "Çəhrayılaşdırmaq"dan *f.is.*

**ÇƏHRAYILAŞDIRMAQ** *f.* Çəhrayı rəngi vermək, açıq-qırmızı rəngdə etmək.

**ÇƏHRAYILAŞMA** "Çəhrayılaşmaq"dan *f.is.*

**ÇƏHRAYILAŞMAQ** *f.* Çəhrayı olmaq, açıq-qırmızı olmaq.

**ÇƏHRAYILIQ** *is*. Çəhrayı rəngdə olan şeyin halı. [Güllünün] *yanaqlarında .. yanar bir çəhrayılıq vardı.* B.Bayramov.

**ÇƏHRAYISİFƏT(Lİ)** *sif.* Üzü, çöhrəsi çəhrayı olan. *Çəhrayısifət, ucaboy qızın üzü əvvəlcə qıpqırmızı, bir an belə keçməmiş isə xal-xal oldu.* M.Hüseyn.

**ÇƏK-ÇEVİR** *is. dan.* Mübahisə, danışıq. *Qərəz, uzun çək-çevirdən sonra Alı kişi bu ustanı da razı elədi.* "Koroğlu". [Qara kişi:] *Aydın məsələdir, canım, daha bunun özgə bir çək-çeviri ola bilməz.* B.Bayramov. ◻ **Çək-çevir eləmək (etmək)** – ölçüb-biçmək, götür-qoy eləmək, hərtərəfli fikirləşmək. **Çək-çevirə salmaq** – bir iş və ya şey haqqında mübahisə etmək, uzatmaq, süründürməyə salmaq. [Fatmanisə:] *Ay adamlar, bu işi çək-çevirə niyə salmısınız?* C.Cabbarlı.

**ÇƏKDİRMƏ** "Çəkdirmək"dən *f.is.*

**ÇƏKDİRMƏK** 1. "Çəkmək"dən *icb. Düyünü tərəzidə çəkdirmək. Divar çəkdirmək. Şəkil çəkdirmək. Rəng çəkdirmək. – Atan sənin şəklini istəyir məndən, bala; Sabah totuq üzünü çəkdirib sallam yola.* S.Rüstəm.

2. Bir sıra isimlərdən sonra gətirilərək, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: dara çəkdirmək, boğazdan çəkdirmək, qəm çəkdirmək, aclıq çəkdirmək və s.

**ÇƏKƏLƏK** *is.* Yüngül ev ayaqqabısı, şap-şap. ..[Lətifə] *rəngbərəng parçadan tikilmiş ev çəkələyində səssiz addımlarla otağında gəzinir.* M.Hüseyn. ..*Qocanın çəkələklərinin şappıltısı və uzun illər boyu qəlyan çəkən adamlara məxsus boğuq öskürəyi eşidildi.* İ.Hüseynov.

**ÇƏKİ**[1] *is.* 1. Bir şeyin tərəzidə çəkilməklə müəyyənləşdirilən ağırlığı; vəzn. *Taxılın çəkisi.* ◻ **Çəki daşı** – şeyləri çəkmək üçün ağırlıq ölçüsü kimi işlədilən müəyyən ağırlıqda cisim, tərəzi daşı. [Tahir] *dəmir çarpayının altında cərgə ilə düzülmüş ağır çəki daşlarını götürdü..* M.Hüseyn. // Ümumiyyətlə, ağırlıq. *Binanın çəkisinin aşağı salınması hazırda – elmi-texniki tərəqqinin sürətlə inkişaf etdiyi bir dövrdə çox vacib problemlərdən biridir.* "Elm və həyat".

2. *məc*. Əhəmiyyət, dəyər, sanbal, siqlət. *Deyirəm, Sabirin vəznli şeri; Çəkidə nə yerə, nə göyə sığmır.* B.Vahabzadə.

◊ **Çəkidə (çəkicə) yüngül, qiymətdə (qiymətcə) ağır** – b a x **vəzncə yüngül, qiymətcə ağır** ("**vəzn**"də) [Milyonçular] *..çəkidə yüngül, qiymətdə ağır əşyadan gəmilərdə əlaltı İrana keçirir, bir növ yır-yığış edirdilər*. S.Rəhimov.

**ÇƏKİ²** *is*. Parça, dəri və s. üzərində rəngbərəng saplarla işlənmiş bəzək: naxış; tikmə. *Nuxa çəkiləri Azərbaycanda şöhrət tapmışdır.* (Qəzetlərdən).

**ÇƏKİ³** b a x **çəkibalığı**. *Çıxardıq dənizə alaqaranlıq; Xəşəmin, çəkinin olmazdı sayı.* N.Xəzri.

**ÇƏKİBALIĞI** *is. zool*. Bədəni yoğun, quyruq hissəsi nazik, uzun, pullu balıq: çəki.

**ÇƏKİC** *is*. 1. Mıx vurmaq, metal döymək və b. bu kimi işlərdə işlədilən metal və ya taxta dəstəyə keçirilmiş müxtəlif formalı metal alət; toxmaq. *Çəkiclə mıx vurmaq. Dülgər çəkici. Dəmirçi çəkici. Daşdoğrayan çəkic*. – [Camal:] *Ay arvad, yadımda ikən get, eyvandan çəkici, beş-altı da mıx qoymuşam, onları gətir.* Ə.Vəliyev.

2. *xüs*. Metalı təzyiqlə işləmək üçün zərbvuran maşın. *Buxar çəkici. Pnevmatik çəkic.*

3. Atmaq, tullamaq üçün çəkicə oxşar idman aləti. *Çəkic atmaq üzrə çempion adı üçün dörd nəfər yarışırdı*. "Azərbaycanın görkəmli idmançıları".

**ÇƏKİCLİ** *sif*. 1. Əlində çəkic olan, çəkiclə işləyən. *Maşının arxasınca üzlərinin xətləri seçilməyən, yaxaları açıq, əlləri çəkicli adamlar gəlir.* S.Hüseyn. [Qara kişi:] *Fərmanı gələcəkdə özü kimi əli mişarlı, rəndəli və çəkicli bir kişi görmək istərdim.* Ə.Sadıq.

2. *xüs*. Çəkici olan, çəkiclə təchiz olunmuş. *Jmıxı .. çəkicli doğrayan maşınlarla doğramaq mümkündür*. "Qaramal".

**ÇƏKİK** *sif.* Bir yana doğru çəkilmiş, dartılmış kimi olan. *Afəridə xanım çəkik gərdənini oynadıb otağa gedəndə Səlim gördü ki, tacirin gözləri işıqlanıb.* M.İbrahimov. // İçəriyə doğru çəkilmiş; batıq.

**ÇƏKİL** *is*. 1. *bot*. Əsasən yarpağı baramaqurduna yedirilmək üçün əkilən tut ağacı növü. [Aqronom:] *Beş ildə verdiyiniz məlumata görə on altı min çəkil, altı hektar meyvə bağı salmısınız*. B.Bayramov.

2. Həmin ağacın barama qurduna yedirilmək üçün istifadə olunan yarpağı. [Yusif:] *..Əməlli-başlı çəkil yoxdur.* B.Bayramov.

**ÇƏKİLİ** *sif*. Üzərində çəkisi olan; tikməli (b a x **çəki²**). [Evin kişisinin] *qırxılmış başında paxlava çəkili ağ araqçın, əynində qara şaldan belibüzməli don .. vardır.* H.Sarabski. [Qız] *boş vaxtlarında Aslan üçün yadigar olaraq çəkili yaylıq hazırlayırdı..* S.Vəliyev.

**ÇƏKİLİŞ** *is*. Çəkilmək işi; çəkilmə. *Yol çəkilişi. Elektrik xətti çəkilişi.*

**ÇƏKİLLİK** *is*. Çoxlu çəkil əkilmiş sahə, çəkil bağı. *Çəkilliyi sulamaq*. – *Yayın cırcıramalı günlərindən birində Səltənətlə Cəmil kəndin qırağındakı çəkillikdə görüşdülər.* Ə.Vəliyev. *..Məsmə, Səkinə, Pəri çəkillikdə ipəkqurdu üçün budaq qırır, şələləyərək daşıyırdılar.* Mir Cəlal.

**ÇƏKİLMƏ** 1. "Çəkilmək"dən *f.is.*

2. *is. coğr*. Dəniz suyu səviyyəsinin vaxtaşırı olaraq enməsi, düşməsi, geriləməsi. *Qabarma və çəkilmə hadisəsi.*

**ÇƏKİLMƏK** 1. "Çəkmək"dən (1-3, 5-8, 10-13, 15, 18-21, 23-27 və 30-cu mənalarda) *məch*.

2. *f.* Durduğu, dayandığı yerdən başqa bir şeyin yanına, yaxud başqa bir tərəfə hərəkət edib durmaq. *Qapıya tərəf çəkilmək*. – *Şölə xanım kor-peşman öz çarpayısına çəkildi.* Ə.Abasov. // Bir yerə gedib orada qalmaq, aram tapmaq. *Sofya xanım otağına çəkilmək meylində idisə də, ayaqları getmir, studentdən aralana bilmirdi.* Çəmənzəminli. *Günəş azca qızan kimi çəkilərdik bağlara; Bağlar bizə mehribandır, sığınırıq bağlara.* S.Vurğun. // Bir yerdən çıxıb getmək, bir yeri tərk etmək. [Kamran:] *Bizdəmi Bakıdan çəkiləcəyik?* H.Nəzərli. // Geri oturmaq, geriyə doğru getmək (getməyə məcbur olmaq). *Düşmənin qoşunu çəkildi.*

3. *f.* Kinofilmdə bu və ya başqa rol ifa etmək; oynamaq. *Artist beş filmdə çəkilmişdir. Baş rolda çəkilmək.*

4. *f.* Yox olmaq, keçib getmək, görünməz olmaq. *Üzünün şişi hələ də çəkilməyib*. – *Qaranlıqlar çəkildi göylərdən, dan söküldü; Hürriyyət şəfəqləri gözlərimizdə güldü.* S.Rüstəm. *Şəkər islanmış tutaş kirpiklərini*

*qaldırıb, Leylanın hələ də qızartısı çəkilməmiş üzünə baxdı.* B.Bayramov.

5. *f. məc.* Dediyindən dönməmək, birinin qabağından qaçmamaq, israr etmək. *Firəngiz çəkilmədi. Başını qaldırıb Muxtarın gözlərinə baxdı.* B.Bayramov.

6. Əmr şəklində: **çəkil!** – get! rədd ol! itil! [Hacı Mehdi:] *İtil gözümün qabağından, çəkil!* Ə.Haqverdiyev. *Çəkil, səni görmək bəladır, məncə; Get, axtar özünə başqa əyləncə!* S.Vurğun.

**ÇƏKİM** *is.* 1. Çəkmək işi; çəkmə.

2. Rəqəmlərlə: – **bir çəkim** – bir dəfə çəkməyə, işlədilməyə, bir dəfəliyə kifayət edəcək miqdar. *Bir çəkim maxorka.* – [Zülfüqar:] *Bir çəkim tənbəki ver, Nəcəfalı baba, səhərdən qəlyansızam, boğazım qovuşur.* B.Bayramov.

**ÇƏKİNDİRMƏ** "Çəkindirmək"dən *f.is.*

**ÇƏKİNDİRMƏK** *f.* Qəbahətli, pis bir işdən saqındırmaq, saxlamaq, qaytarmaq. [Sevinc:] *Buraxılan bir səhv insanı həmişə yanlış işlərdən çəkindirir.* Z.Xəlil.

**ÇƏKİNGƏN** *sif.* Hər şeydən çəkinən, qorxan, ürkən, ehtiyat edən; cəsarətsiz.

**ÇƏKİNGƏNLİK** *is.* Çəkingən adamın xasiyyəti.

**ÇƏKİNMƏ** "Çəkinmək"dən *f.is.*

**ÇƏKİNMƏDƏN** *zərf* 1. Qorxmadan, ehtiyat etmədən, sərbəst surətdə. *Çəkinmədən fikrini söyləyə bilərsən.* [Güləsərlə Salatın] *elə uşaqlıqdan Kürdə yan-yana çimir, bir-birindən çəkinmədən soyunub suya atılırdılar.* İ.Şıxlı.

2. Həyasızcasına, özünü saxlamadan, xəcalət çəkmədən. *Çəkinmədən böyüyün üzünə qabarmaq.*

**ÇƏKİNMƏK** *f.* 1. Hər hansı bir səbəbə görə bir şeyi etməyə əli getməmək. [Pərzad:] *Səndən* [*Bayramdan*] *çəkinirəm. Əgər sən rüsxət versən, bir gün bu dərdlə özümü sağ qoymanam!* M.F.Axundzadə. *..Ancaq* [Gülpəri] *Baharı aşkar qovmaqdan çəkinirdi, çünki Bahar körpə vaxtından Hacı Nəsirin evində böyümüşdü.* S.S.Axundov.

2. Ehtiyat etmək, saqınmaq, qorxmaq. *..İnmirə məhəlləsinin camaatı da Əlidən çəkinərdi və özü də bunu guya sevirlər, buna hörmət edirlər.* N.Nərimanov. [Solmaz:] *Bütün xalqın nicatı üçün mənim qurbanlığım gərəksə, mən çəkinməyəcəyəm!* C.Cabbarlı.

**çəkinə-çəkinə** *zərf* Ehtiyatla, qorxa-qorxa. *Çəkinə-çəkinə danışmaq. – Xeyli sükutdan sonra özündən böyüklə danışırmış kimi çəkinə-çəkinə soruşdu: – Ağcanın dediyi gerçəkdirmi?* İ.Məlikzadə.

**ÇƏKİNMƏZ** *sif.* Heç bir şeydən çəkinməyən, qorxmayan, ehtiyat etməyən.

**ÇƏKİNTİ** *is.* Papiros, siqaret kötüyü (qırıntısı).

**ÇƏKİSİZ** 1. *sif.* Çəkisi, ağırlığı olmayan. *Çəkisiz qız.*

2. *zərf* Tərəzidə çəkmədən, çəkisini müəyyən etmədən. *Qarpızı çəkisiz satmaq.*

**ÇƏKİSİZLİK** *is. xüs.* Yerin cazibə qüvvəsinin təsir etmədiyi şəraitdə cismin çəkisinin (ağırlığının) hiss olunmadığı vəziyyət, hal. *Kosmik gəmi orbitə çıxıb daşıyıcı raketdən ayrıldıqdan sonra çəkisizlik əmələ gəldi.* (Qəzetlərdən).

**ÇƏKİŞDİRMƏ** "Çəkişdirmək"dən *f.is.*

**ÇƏKİŞDİRMƏK** 1. *f.* Əlləşdirmək, dartışdırmaq, yavaşca dartmaq. *Saçını çəkişdirmək. – Tahir xallı atı quzu kimi oxşayıb sevdi, onun yalmanını çəkişdirdi.* S.Rəhimov.

2. *f.* Dartmaq, çəkmək. [Ələmdar] *..qapının tutacağından yapışdı, ayaqlarını döşəməyə dayayıb çəkişdirdi.* S.Rəhimov. *Şahmar nənəsinin qolundan yapışıb, nə qədər çəkişdirdisə də qarı yerindən tərpənmədi..* B.Bayramov.

3. *qarş.* Dartışdırmaq. *Uşaqlar bir-birini çəkişdirib sakitləşməyə çalışdılar.* S.Rəhimov.

**ÇƏKİŞMƏ** 1. "Çəkişmək"dən *f.is.*

2. Mübahisə, münaqişə, dava, qalmaqal. *Qoşulmaq istəmirdim mən bu çəkişmələrə; Ancaq çox nahaq yerə!* B.Vahabzadə.

**ÇƏKİŞMƏK** *qarş.* 1. Mübarizə etmək, çarpışmaq. *Çəkişməsən bərkiməzsən.* (Ata. sözü). *Çox adam* [İslamdan] *çəkinər, onunla çəkişmək istəməzdi.* S.Hüseyn.

2. Mübahisə etmək. *Bu arada müştərilər hərlənir, qiymət üstündə uzun-uzadı çəkişirdilər.* S.Rəhimov.

3. Mərc çəkmək. *Firuzə cücənin cınağını götürərək Sərvnaza tərəf uzadıb: – Gəl çəkişək, – deyir.* İ.Əfəndiyev.

**ÇƏKMƏ** 1. "Çəkmək"dən *f.is.*

2. Bax **botinka**. // Ümumiyyətlə, ayaqqabı. *Gəzən adamlar* [Dəmirovun] *uzunboğaz çəkmələrinə, boz şinelinə diqqət yetirirdilər.* S.Rəhimov. [Zəhranın] *ayağında dizdən əsgər çəkməsi vardı.* Ə.Vəliyev.

3. *məh.* bax **daşma²**. *Gülsüm xala danışığı kəsib, aralığa bir süfrə saldı və üstünə bir boşqab dolu düyü çəkməsi, çörək, pendir və qatıq qoydu.* E.Sultanov.

**ÇƏKMƏCƏ** *is.* Yeşik, siyirmə (stol və s.-də). [Ağaverdi] *vaxtilə əlindəki vərəqələrin nömrələrini qarşısında oturduğu masanın çəkməcəsinin alt tərəfinə yazmış*(*dı*). S.Hüseyn.

**ÇƏKMƏÇİ** *is.* Ayaqqabı tikmək və təmir etməklə məşğul olan adam. *Çəkməçilər önündə döşlük, əldə çərməki, ayaqyalın çıxmışdılar.* Mir Cəlal.

**ÇƏKMƏÇİLİK** *is.* Çəkməçinin sənəti, ayaqqabı tikmək və təmir etməklə məşğul olma.

**ÇƏKMƏK** *f.* 1. Bir şeyi tutub özünə və ya başqa bir tərəfə dartmaq. *İpi çəkmək.*

2. Özünə tərəf çəkərək açmaq. *Yazı stolunun yeşiyini çəkmək. Kamodun gözünü çəkmək. – Sədr stolun siyirməsini çəkib, böyük bir yazılı vərəq çıxartdı.* M.İbrahimov.

3. Bir şeyi başqa bir şeyin içərisindən çəkib çıxarmaq. *Qılıncı qınından çəkmək. – Rüstəm kişi .. tüstülətməkdə olduğu trubkasını ağzından çəkdi..* M.İbrahimov. *Hacı səsindən Mərdanı tanıdı və qəlyanını ağzından çəkdi.* Mir Cəlal.

4. Dartmaq, tutmaq. *Çəkib Əmirxanın qolundan Elyar; Apardı onların üstünə sarı.* S.Vurğun.

5. Sıxmaq, dartmaq. *Cəmil təzə atlaz köynəyi geydi və üstündən əsgər toqqasını bərk çəkdi.* Q.İlkin. *Belini sadə ensiz qayışla bərk çəkdiyi üçün* [İkram] *əslində olduğundan artıq gözə dəyirdi.* Ə.Əbülhəsən.

6. Özünə və ya başqasına yaxınlaşdırmaq, yaxın qoymaq. *Nimçəni qonağa tərəf çəkmək. – Həsən kişi tünd çay dolu stəkanı qabağına çəkdi.* M.İbrahimov. *Mərdan Gövhərin qabağına çay qoydu. Qənddanı ona tərəf çəkdi.* İ.Qasımov.

7. Lazımi yerə qoymaq, yaxınlaşdırmaq. *Stolu pəncərəyə tərəf çəkmək.* – [Nəbi:] *Kürsünü çək, otur.* S.S.Axundov.

8. Qolundan və s.-dən tutaraq içəri aparmaq və ya bayıra çıxarmaq. *Qonaqları içəri çəkmək. – Qarı atları tövləyə çəkib, yem verdi.* (Nağıl).

9. Bir yerə və ya bir şeyin yanına aparmaq. *Mətbəxə çəkmək.* – [Qadın] *sonra qolumdan tutub, çəhrayı abajurlu elektrik çırağının altında qoyulmuş ağ örtüklü stola tərəf çəkdi..* İ.Əfəndiyev. *Cuma Göyçəyi stansiyanın qaranlıq guşəsinə çəkdi.* Ə.Əbülhəsən.

10. Örtmək, bağlamaq, qapamaq. *Pəncərəni çəkmək. – Kişi qapıları çəkmək istədi.* Mir Cəlal. *Aslanın anası dalımca qapını çəkdi, gəldiyi kimi də səssizcə addımlarla qayıdıb, yerinə uzandı.* M.Hüseyn. // Örtmək, salmaq. *Ağca xanım yorğanı başına çəkib, .. bir azdan sonra yuxuya getdi.* S.S.Axundov. [Maya] *mil-mil göy adyalı üstünə çəkdi.* M.İbrahimov.

11. Sərmək, salmaq. *Stolun üstünə süfrə çəkmək.*

12. Yemək üçün xörəyi qablara qoymaq. *Aşı nimçəyə çəkdi. – Arvad bir nimçə sıyıq çəkib, qoydu ortalığa.* (Nağıl). [Qərənfil xala] *xörəyi çəkdi, ərinin qabağına qoyub, toyuqları hinə salmaq üçün həyətə çıxdı.* Ə.Vəliyev.

13. Bir şeyin, adətən tütünün tüstüsünü içinə almaq və buraxmaq. *Çubuq çəkmək. Trubka çəkmək.* – [Əbdül:] *Gördüm, Kərim oturub, qəlyan çəkir.* Ə.Haqverdiyev. *Əvəz kişi də dərdli-dərdli papiros çəkməyə başladı.* Ə.Vəliyev.

14. Davam etmək, sürmək, vaxt aparmaq. *İmtahan üç saat çəkdi. Konsert iki saat çəkdi. İclas uzun çəkdi. – Bu yoxlama yarım saata qədər çəkdi.* H.Nəzərli. *Bu toyların bir çoxu iki-üç gün çəkmişdi.* S.Rəhimov.

15. Üyütmək, un, yarma və s. halına salmaq. *Buğdanı çəkmək. – Axşam lampa işığında Telli əldəyirmanilə yarma çəkirdi.* S.Hüseyn.

16. Götürmək, qaldırmaq. *..Veys* [Ağasəfərin] *sözünü kəsdi və membranı valın üstündən çəkmək istədi.* Ə.Əbülhəsən.

17. Vurmaq, ilişdirmək. *Şillə çəkmək. – Nəbi naçənniyə bir neçə çəkdi. Naçənnik yalvarmağa başladı.* "Qaçaq Nəbi". *Uşaq .. söyüd çubuğu ilə Əkbərin çılpaq baldırına çəkdi.* Mir Cəlal.

18. Çəkisini müəyyənləşdirmək. *Qızıl gülü əkərlər; Misqal ilə çəkərlər.* (Məsəl). [Xudayar bəy:] *Götür, bir kəllə çək, görək nə qədər gələr?* C.Məmmədquluzadə.

19. Tikmək, etmək. *Hasar çəkmək. Divar çəkmək. – ..Bu il biz çaya bənd çəkib, qırıq taxta körpünün əvəzinə dəmir, asma körpü quracağıq.* Ə.Vəliyev.

20. Kanal, yol və s. düzəltmək; tikmək. *Şose yolu çəkmək. Suvarma kanalı çəkmək.*

21. Telefon, elektrik, radio və s. ilə təchiz etmək üçün müəyyən işlər görmək. *Telefon çəkmək. İşıq çəkmək. Radio çəkmək.*

22**.** Sürtmək, gəzdirmək, sığallamaq. *Əlini üzünə çəkmək. – Zəhra, yaralının başını dizi üstünə aldı, əlini başına çəkdi.* Ə.Vəliyev. *Əmrah əllərini bığına çəkdi, ilğımdan qamaşan gözlərini qıydı.* Q.İlkin.

23. Rəsm etmək. *Kənd mənzərəsi çəkmək.* – [Tapdıq] *şəkilləri də ala-babat çəkib qurtardı.* Ə.Vəliyev. [Ləman] *qayınanasının şəklini bir çox vəziyyətlərdə çəkmişdi.* H.Seyidbəyli.

24. Fotoaparatla şəkil almaq. *Şəkil çəkmək. Nümayişçiləri çəkmək.*

25. Geymək. *Plaşını əyninə çəkmək.* – [Bəbir bəy] *gümüş toqqasını bağladı. Boğazlı çəkməsini ayağına çəkdi.* Mir Cəlal.

26. Rəngləmək, boyalamaq, rəng (boya) sürtmək. *Evin səqfinə rəng çəkmək.*

27. Malalamaq, suvaqlamaq. *Mala çəkmək. Astar çəkmək.*

28. *məc*. Cəlb etmək, həvəsləndirmək, çox maraqlandırmaq. *Kənd mövzusu rəssamı çəkir.*

29. *məc*. Oxşamaq, bənzəmək. *Atasına çəkmək.* – [Rüstəm Mayaya:] *Ana tərəfə çəkmisən, Qarabağ xanımları zərif doğrayan olur*. M.İbrahimov.

30. Destillə yolu ilə bir maddədən başqa maddə almaq, tədqiq etmək. *Spirt çəkmək. Araq çəkmək.*

31. Bir sıra isimlərdən sonra gətirilərək, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: zəhmət çəkmək, qəm çəkmək, baş çəkmək, ah çəkmək, misal çəkmək, keşik çəkmək, əzab çəkmək, dağ çəkmək və s.

**ÇƏKMƏLİ** *sif.* Çəkmə geymiş, ayağında çəkmə olan. // Ayaqqabı geymiş, ayağında ayaqqabı olan. *"Anasının balası, elə çalıb oxumazlar". Bu sözləri deyən uca boylu, buxara papaqlı, bənövşəyi şivyotdan köynək və qəlifə şalvar geymiş, uzunboğaz çəkməli cavan bir oğlan idi.* İ.Şıxlı.

**ÇƏKMƏLİK** *sif.* Çəkmə tikmək üçün yarayan, çəkmə tikmək üçün ayrılmış. *Çəkməlik dəri.*

**ÇƏKMƏSİLƏN** *is.* Ayaqqabı silmək və rəngləməklə məşğul olan adam. *Çəkməsilən mənimlə öcəşməyə və məni ələ salmağa başlamışdı.* M.S.Ordubadi.

**ÇƏLƏNG** *is.* Gül və ya bitkilərdən dairə şəklində hörülmüş zinət, bəzək. *Bu yaxında bir də ora qayıdaram mən; Bəxtiyarın qəbri üstə qoyarıq çələng.* Ə.Cəmil. *Gənc qızlar yüyürüşüb oğlanın başına ətirli dağ çiçəklərindən .. hörülmüş çələnglər qoydular.* M.Rzaquluzadə. // Obrazlı təşbehlərdə. [Uluq bəy:] *..Mənə bax, gözümdən qəlbimi oxu; Sevgidən başıma bir çələng toxu..* A.Şaiq. *Alovdan başına çələng taxmısan; Püskürüb çəmənə, çölə axmısan.* N.Xəzri.

**ÇƏLİK**[1] *is.* Əl ağacı, əsa. [Müəllim] *çəliyini əlinə alıb, yavaş-yavaş Qaçaygilə getdi.* Ə.Vəliyev. *Çəliyini yerə o döyə-döyə; Asta addımlarla qalxır kürsüyə.* B.Vahabzadə. // Əkilmək üçün qısa kəsilmiş budaq; qələm.

**ÇƏLİK**[2] *is.* Möhkəm dəmir, polad. *Çünki sənin heykəlin nə tuncdan, nə çəlikdən; Ölməz o abidənin özün oldun memarı.* R.Rza. // *məc.* Polad kimi, dəmir. *Bir çəlik yaysan, əyilməzsən sən; Qalalar çöksə, sökülməzsən sən.* M.Müşfiq. *Azəri yurdunun zəhmətkeş oğlu; Çəlikdir duruşu, dəmirdən qolu.* S.Vurğun.

**ÇƏLİM** *is.* Bədən, vücud, cüssə, bədən quruluşu.

**ÇƏLİMLİ** *sif.* Bədən quruluşu gözəl; təndürüst.

**ÇƏLİMSİZ** *sif.* Arıq, sısqa, bədəncə zəif. [Avtobusdan] *son enən ortayaşlı .. bir kişi, arıq arvadı və çəlimsiz xırda qızı oldu.* Çəmənzəminli. *Uzun qollar Xəlilin çəlimsiz bədənini məngənə təkin sıxdı.* İ.Məlikzadə.

**ÇƏLLƏK** *is.* 1. İçində maye şeylər saxlamaq və daşımaq və s. məqsədlər üçün işlədilən yastıdibli, ortası enli, ətrafına çənbər çəkilmiş taxtadan (bəzən də dəmirdən) qayrılmış iri qab. *Çəlləklərdə saxlanılan su yanğına qarşı mübarizə üçün kifayət deyildi.* S.Vəliyev. *Malakan kəndinin içməli suyu, dərə dibindəki gur bulaqdan bu çəlləkli arabalarla yuxarıya daşınırdı.* Ə.Məmmədxanlı.

2. Taxta satıl, vedrə. [Yaşlı kişi:] *Şirinnaz iki dəfə çəlləyi quyuya sallayıb çəkdi.* S.Hüseynov.

**ÇƏLLƏKCİK** *is.* Kiçik çəllək, balaca çəllək. *Çəlləkcikdə gül əkmək.*

**ÇƏLLƏKÇİ** *is.* Çəllək qayıran usta.

**ÇƏLLƏKÇİLİK** *is.* Çəlləkçi sənəti.

**ÇƏLPƏŞİK** b a x **çalpaşıq**. [Hakimi-şər:] *Xub, bu iş çox çəlpəşik və uzun çəkəsi iş deyil.* M.F.Axundzadə. [Direktor:] *Harada çəlpəşik iş var, elə mənim başımda gərək çatlasın.* Mir Cəlal.

**ÇƏLTİK** *is.* 1. Qabığı çıxarılmamış düyü (əkmək üçün). *Çəltik tarlası. Çəltik əkmək.* – *..Dizə qədər suyun-palçığın içində çəltik əkini üçün yeni sahələr hazırlayan kəndlilər gözümdə canlanırdı.* M.İbrahimov.

2. Həmin bitkinin yem kimi istifadə olunan gövdəsi və yarpaqları. *Çəltik tayası.*

3. Qabıqlı düyü. [İbn Mingə:] – *Çəltik gərək döyülsün ki, düyü olsun və sizin lisanınızda ən fəsih kəlam budur mənim üçün!..* Ə.Məmmədxanlı.

**ÇƏLTİKÇİ** *is.* Çəltik əkib-becərməklə məşğul olan adam; çəltikçilik mütəxəssisi. *Çəltikçi aqronom.*

**ÇƏLTİKÇİLİK** *is.* Kənd təsərrüfatının çəltik əkib-becərməklə məşğul olan sahəsi; çəltik becərmə.

**ÇƏLTİKLİ** *sif.* Yaxşı təmizlənməmiş, çəltiyi olan (düyü). *..Hər fəhləyə ayda 25 kilo çəltikli düyü verirlər.* M.İbrahimov.

**ÇƏLTİKLİK** *is.* Çəltik əkilmiş yer, çəltik tarlası.

**ÇƏM** *is. dan.* Qayda, üsul, yol. *Doğrudan da hər ovun öz çəmi varmış.* M.Rzaquluzadə.

◊ **İşin çəmini tapmaq** – b a x **işin ucunu (çəmini) tapmaq** (**"iş"**də).

**ÇƏMƏN** *is.* [*fars.*] Yaşıl otla örtülmüş sahə; yaşıllıq. *Yaşıl çəmən.* – *Yumşaq göy çəmənin üstə düşüb şeh gecədən; İsti yoxdur, hələ var bir balaca meh gecədən.* A.Səhhət. *Laləli, nərgizli çəmənlərə də; Baxırıq maşının pəncərəsindən.* B.Vahabzadə.

**ÇƏMƏNCİK** *is.* Kiçik çəmən, balaca çəmənlik.

**ÇƏMƏNÇİ** *is.* Çəmənçilik mütəxəssisi.

**ÇƏMƏNÇİLİK** *is.* Kənd təsərrüfatının, təbii çəmənləri yaxşılaşdırmaq və yeni çəmənlər salmaqla məşğul olan sahəsi.

**ÇƏMƏNLİ** *sif.* Çəmənləri olan, çəmənlik. *Gəzdim ovçu kimi hər oylağında; Çəmənli, çiçəkli göy yaylağında.* Aşıq Şəmşir. *Göy çəmənli yaylaqlarım! Qəlbim isti, canım sağdır.* S.Vurğun.

**ÇƏMƏNLİK** *is.* Çəmən olan sahə, yaşıl ot bitmiş yer. *Gördüm ki, bir rəna çəmənlikdəyəm; Dörd yanımda var al-əlvan çiçəklər.* A.Səhhət. *Qulaq asdı sıra dağlar, çəmənliklər, zəmilər; Göy üzündə təyyarələr, su altında gəmilər.* S.Vurğun.

**ÇƏMƏNZAR, ÇƏMƏNGAH** [*fars.*] b a x **çəmənlik**. *Kərəm gördü ki, bir dəstə cavan çəməngahda çalıb, oxuyub oynayır.* "Əsli və Kərəm". *Gözlə məni, zaman gələr görüşərik ilk baharda; İpək telli çiçəklərin sayrışdığı çəmənzarda.* S.Vurğun.

**ÇƏM-XƏM** *is. dan.* Naz, qəmzə, əzilib-büzülmə. *Bilsə idim dözəməm mən nazına, çəm-xəminə; Heç qoyub üstümə bu adı, mən evlənməz idim!* Ə.Nəzmi. [Ataş:] *Qızların nazı, çəm-xəmi, umu-küsüsü, lap axırda da hirsi, hikkələri.* Ə.Vəliyev. ☐ **Çəm-xəm etmək** – 1) naz-qəmzə etmək, özünü naza qoymaq, əzilib-büzülmək. *Xanım başladı çəm-xəm eləməyə ki, mən oynamaq bacarmıram..* C.Məmmədquluzadə; 2) Boyun qaçırmaq, özünü naza qoymaq. [Xəlil:] *Heç çəm-xəm eləmə, Xəlil ki bir işə girişdi, öldü var, döndü yoxdur.* S.Rəhman.

**ÇƏM-XƏMLİ** *sif. dan.* Nazlı, qəmzəli, naz-qəmzəli. *Dolanım başına, ey nazlıca yarım, bəri bax; Şivəli, qəmzəli, çəm-xəmli nigarım, bəri bax.* S.Ə.Şirvani.

**ÇƏMKİRMƏ** "Çəmkirmək"dən *f.is.*

**ÇƏMKİRMƏK** b a x **çımxırmaq**. *Rəngi qaçmış və güclə nəfəs alan qadın hərdənbir çocuqlara çəmkirirdi.* Çəmənzəminli. [Adi-

lənin] *anası diksinib ayağa qalxdı, ərinə nə isə demək istəyirdi ki, birdən dönüb Fatı qarının üstünə çəmkirdi: – Get, arvad, nə qulaq asırsan?* Ə.Məmmədxanlı.

**ÇƏN¹** *is.* İçində maye, qaz və s. saxlanılan çox yekə qab; rezervuar. *Sıxılmış hava çəni. Nefti çənə axıtmaq.* – [Maya:] *Beş-on metr hündürlükdə bir çən qoyulur, suvuran nasoslar çayın suyunu ora qaldırır.* M.İbrahimov. *Böyük çənləri su ilə doldurmaq, bunların altını yandırmaq və sairə bu kimi işlərdə qoca yoxsul arvadlar və xırda uşaqlar işləyir, cümə axşamları qəpik-quruş alırdılar.* Ə.Əbülhəsən.

**ÇƏN²** *is.* Rütubətli duman pərdəsi; sis. *Çən get-gedə daha da qatılaşırdı.* M.Hüseyn. [Mübaşir Məmməd və Əli əmniyyəbaşı] *qara bir kölgə kimi payız səhərinin çəni içərisində itdilər.* M.İbrahimov.

**ÇƏNBƏR** *is.* [*fars.*] 1. Çəllək və s.-nin dövrəsinə keçirilən dəmir və s. materialdan qurşaq. *Çəlləyin çənbəri. Dəmir çənbər.*

2. Dəf və bu kimi şeylərin dairəsi; sağanaq. *Dəfin çənbəri.*

3. Keçmişdə: suya və ya neftə yaxşı batmaqdan ötrü dolun (tuluğun) yuxarı tərəfinə ağırlıq üçün bağlanan dairəvi dəmir. *Dolun çənbəri. – Qızılı sərrafdan soruş, çənbəri quyuçudan.* (Ata. sözü).

4. Dairə şəklində olan; devrik. *Müəllim vəd verdi ki, qayıdanda* [Tapdığa] *bir yaxşı dovşan alıb gətirsin; qulaqları uzun, quyruğu da çənbər.* Ə.Vəliyev.

5. Qurşaq, bandaj.

**ÇƏNBƏRBIĞ(LI)** *sif.* Bığının ucları çənbər kimi yuxarıya doğru əyilmiş olan. *İndi artıq heç bir şübhə yeri qalmadı... o çənbərbığlı gənc Vəlidən başqa kim ola bilərdi?* M.Hüseyn.

**ÇƏNBƏRBURUN(LU)** *sif.* Burnunun ucu geriyə doğru əyilmiş olan. *Çənbərburun qoca.*

**ÇƏNBƏRQUYRUQ** 1. *is. məh*. Əqrəb.

2. Bax **çənbərquyruqlu**. *Çənbərquyruq it.*

**ÇƏNBƏRQUYRUQLU** *sif.* Quyruğu çənbər şəklində əyilmiş olan; devrik. *Çənbərquyruqlu dovşan.* – [Güləli] *çənbərquyruqlu ala iti kəmsiyindən açıb yanına aldı, ulu babasından qalan çaxmaqlı tüfəngi də çiyninə saldı.* S.Rəhimov.

**ÇƏNBƏRLƏMƏ** "Çənbərləmək"dən *f.is.*

**ÇƏNBƏRLƏMƏK** *f.* 1. Çəllək və s.-yə çənbər keçirmək; qurşaqlamaq. *Çəlləyi çənbərləmək.*

2. Çənbər şəklinə salmaq. *Əqrəb quyruğunu çənbərlədi. – Qərəz, arvad ilan kimin quyruğun çənbərləyib qoydu belinə.* (Nağıl).

**ÇƏN-DUMAN** *is.* Qatı duman, sis. *Hərdən elə olurdu ki, bir su içim saatda çən-duman Çənlibeli bürüyürdü.* "Koroğlu". *Yenə Muğanın üfüqləri daralmağa, mavi boşluqları çənədumana bürünməyə başlayırdı.* M.İbrahimov.

**ÇƏNƏ** *is.* 1. Üzün ağzı əmələ gətirən iki yarımdairə sümüyü; üst çənə burundan aşağıda, ağızdan yuxarıda, alt çənə ağızdan aşağıda yerləşir, alt çənə mütəhərrikdir, qalxıbenir. *Xanım masanın üstündən kitabı götürdü, dirsəyinə dayaq verərək əlini çənəsinə söykədi.* Çəmənzəminli. *Bir əli ilə anasının döşündən möhkəm yapışmış körpə o biri əli ilə anasının üzünü, çənəsini əlləyirdi.* Ə.Vəliyev.

2. *xüs.* Məngənə və s. sıxıcı alətlərin şeyi sıxan tərəflərindən hər biri. *Məngənənin çənələrini yeyilməkdən qorumaq üçün onların işlək üzlərinə vintlər vasitəsilə poladdan hazırlanmış və su verilmiş dodaqlar bağlanır.* "Neft maşınqayırma texnologiyası".

◊ **Çənə atmaq** – can vermək. [Hacı Fərəc Molla Ələsgərə:] *Yasini avaz ilə oxu! Görməyirsən, kişi çənə atır.* M.Əliyev. **Çənə vurmaq (döymək)** – l) çox danışmaq. [Səfər bəy:] *Səndən qabaq o biri otaqda oturub, Molla Abuşla azı dörd saat çənə döymüşəm ki, qızı mənə versin.* B.Talıblı; 2) mübahisə etmək. [Vəzir Cahana:] *Ağa Kərim xanla bu işdə mən o qədər çənə vurmuşam, dilim-dodağım qabar olub.* N.Vəzirov. *Alış-verişçilər də İrandan gələn alış-verişçilərə yanaşaraq, düyü, kişmiş və sair şeylərin qiymәti üzərində çənə döyürdülər.* M.S.Ordubadi. **Çənəsi qızışmaq** – həddən çox danışmaq, danışığına ara verməmək. *Hümmətin çənəsi elə qızışmışdı ki, suallarına cavab gözləmirdi.* B.Bayramov. **Çənəsini boş qoymaq** – danışığına fikir verməmək, ağzıboşluq göstərmək. *Manafın can yandırması, qayğıkeşliyi müqabilində* [Bəyim] *çənəsini boş qoyub ağzına gələnləri dedi*. Ə.Vəliyev.

**ÇƏNƏBAZAR** *is. dan*. Mübahisə, sözləşmə. [Faytonçu:] *Yəqin çənəbazar ilə də aran yoxdur.* Ə.Haqverdiyev.

◊ **Çənəbazara (çənəbazarına) çıxmaq** – mübahisə etmək. [Həkim:] *Bura sənin dükanın deyil, çənəbazarına çıxasan. Xahiş eləmirsən, gedə bilərsən.* Ə.Haqverdiyev.

**ÇƏNƏ-BOĞAZ** *is. dan*. Mübahisə. [Yunis:] *Vaxtında bir, ya beş gün əvvəl material tədarükünə düşsəniz, çənə-boğaza ehtiyac qalmaz.* Mir Cəlal.

◊ **Çənə-boğaz etmək (döymək)** – mübahisə etmək. [Leylək Ələmdar:] *Qanacağınız olsun, adamsınız, belə çənə-boğaz eləmək yaraşmaz!* S.Rəhimov. *İki saat idi ki,* [Mahmud] *texniki təchizat şöbəsinin müdirilə çənə-boğaz döyürdü.* Y.Əzimzadə.

**ÇƏNƏLƏŞMƏ** "Çənələşmək"dən *f.is.*

**ÇƏNƏLƏŞMƏK** *f.* Mübahisə etmək. *Starşina ilə, pristavla çənələşmək asan iş deyil, bir az hətta xatası da var.* N.Nərimanov.

**ÇƏNG**[1] *is.*: **çəng olmaq** – qıc olmaq, keyləşmək, hərəkətdən düşmək, hissizləşmək. *Əl-ayağı çəng olmaq.* – [Gülo:] *Deməli, mənim yaşamağım üçün o ölməlidir! Sonra? Bəs sonra?! – deyib, iflic tutmuş kimi barmaqları çəng olub qıvrıldı.* S.Rəhimov.

**ÇƏNG**[2] *is.* [*fars.*] Əl, pəncə. *Tülək tərlan təki qafil Həsən bəy; Şığıyıb çənginə götürdü bayaq.* Q.Zakir.

◊ **Çənginə keçirmək** – ələ keçirmək, pəncəsinə keçirmək.

**ÇƏNG**[3] *is*. [*fars.*] Formaca arfaya oxşayan qədim Şərq simli musiqi alətlərindən biri. *O yanda Sədi vəquranə çöhrəsilə baxar; Bu yanda nayü dəfü çəng kainatı yıxar.* M.Hadi. *İki dəqiqə keçməmişdi, bir dəstə cariyə əllərində ud və çəng oxuya-oxuya meşəyə girdi.* M.S.Ordubadi. ..[İnsanlar] *kamanların altına çanaqlar qayırıb, kirişlərin də sayını artırmaq yolu ilə nəticədə arfa və arfaya bənzər çəng musiqi alətlərini ixtira edirlər.* Ə.Bədəlbəyli.

**ÇƏNG**[4] *is.* Dırmıq (kənd təsərrüfatı aləti).

**ÇƏNGƏ** *is.* [*fars.*] Bir ovucluq. (adətən rəqəmlərlə). *Bir çəngə ot.* – [Şərəfnisə xanım:] *Uşağı yerə girsin. Dinc oturur məgər! Səhərdən bəri qoymuyub ki, iki çəngə yun darıyım, elə şitəngilik edir..* M.F.Axundzadə. *Sənəm qarı .. balağından çəngə ilə dən götürüb .. toyuq-cücələrə səpirdi.* Ə.Məmmədxanlı.

**ÇƏNGƏL** *is.* [*fars.*] 1. Yeyilən şeyin parçalarını götürmək üçün bir neçə uzun dişi olan alət. *Qubernator çəngəlin ucu ilə xörəyi yoxlayaraq soruşdu..* M.S.Ordubadi. *Qafar əllərini yuduqdan sonra kiçik şkafdan stol üstünə boşqab və çəngəl qoydu.* Ə.Əbülhəsən.

2. Şey asmaq üçün qarmaq; asılqan, asqı. *..Stolun üstünə təmiz bir örtük salınmış, ağ üz dəsmalı əlüzyuyanın yanındakı çəngəldən asılmış, çay dəsgahının və yemək qablarının üstünə ağ dəsmal salınmışdı.* M.S.Ordubadi. [Maral] *sonra da şalını açıb, çəngəldən asdı.* Ə.Əbülhəsən. // Kəsilmiş heyvanların cəmdəyini və iri ət parçalarını asmaq üçün iri qarmaq; qənarə. *Çəngəldən asılan şaqqalar süni yarpaqlarla bəzənmişdi.* Çəmənzəminli.

3. Şey qaldırmaq üçün ucu yuxarı əyilmiş mil; qarmaq. *Qaldırıcı kranın çəngəli.*

4. *tex.* Haça şəklində olan müxtəlif şeylərin, alətlərin adı. *Ştepsel çəngəli.*

5. Şahmat oyununda: bir fiqurun eyni zamanda iki və ya bir neçə fiquru təhlükə altına aldığı vəziyyət. *Piyadanın iki düşmən daşına birdən hücum etməsi çəngəl adlanır.* "Şahmat oyunu".

6. *hərb.* Atılan mərmilərdən birinin hədəfdən uzağa, o birinin isə yaxına düşməsi nəticəsində doğan vəziyyət. *Hədəfi çəngələ almaq.*

7. *məc*. İnkişafa, tərəqqiyə, sərbəstliyə mane olan, onlara imkan verməyən şey haqqında; çəng. *Millətin yüz minlərlə oğul və qızlarını ehtiyac, zülm və elmsizlik çəngəlindən qurtarmadan milli oyanma mümkün deyildi.* M.İbrahimov. [Ovçu:] *Mövhumat çəngəlində məhv olan sevgilimin intiqamını almalıyam.* Ə.Məmmədxanlı.

**ÇƏNGƏL-BIÇAQ** *top.* Çəngəl və bıçaqlardan ibarət yemək alətləri komplekti. [Cəfər] *qulluqçunu çağırdı. Boşqablar və çəngəl-bıçaq gəldi, qarpız kəsildi.* Çəmənzəminli. *Evdə hər cür örtüklər, qab-qacaq, çəngəl-bıçaq və sairə var idi.* Ə.Sadıq.

**ÇƏNGƏLƏMƏ** "Çəngələmək"dən *f.is.*

**ÇƏNGƏLƏMƏK** *f.* Pəncəsi ilə tutmaq, tutub götürmək. *Müxbir iki əli ilə saçlarını*

*çəngələyərək qapı ağzındakı stul üstünə yıxıldı.* Ə.Məmmədxanlı. [Səməndər] *çəngələdiyi otu tüstülənən papirosun üstünə atdı..* B.Bayramov.

**ÇƏNGƏLƏŞMƏ** "Çəngələşmək"dən *f.is.*

**ÇƏNGƏLƏŞMƏK** *qarş. dan.* Əlbəyaxa vuruşmaq. [Şərif:] *Mən əjdahalarla çəngələşmişəm.* C.Cabbarlı.

**ÇƏNGƏLLƏMƏ** "Çəngəlləmək"dən *f.is.*

**ÇƏNGƏLLƏMƏK** *f.* Çəngələ taxmaq, çəngələ keçirmək, çəngəllə götürmək.

**ÇƏNGƏLLƏNMƏ** "Çəngəllənmək"dən *f.is.*

**ÇƏNGƏLLƏNMƏK** *məch.* Çəngələ taxılmaq, çəngələ keçirilmək, çəngəllə götürülmək.

**ÇƏNGİ** *is.* 1. Dəf çalıb oxuyan və göbək atmaq kimi rəqslər oynayan rəqqasə (başlıca qaraçı qızlardan olur). [Şəhrəbanu xanım:] [Hatəmxan ağa] *israğagün aşnası zərdablı Qurban bəyə kağız yazırdı ki, Şamaxı çəngilərinin vədəsini alsın, toya göndərsin.* M.F.Axundzadə.

2. Əxlaqsız, həyasız qadın mənasında. [Ziba xanım:] *Sənin* [vəzirin] *gözün örtülüb, uyubsan bir çənginin məkrinə, felinə, təmiz adını-sanını itiribsən.* M.F.Axundzadə. // Eyni mənada söyüş kimi işlədilir. [Məşədi Ağabanı Haf Səkinəyə:] *Ağız, ay mütrüb, ay çəngi, mən sındırmalı qoz degiləm sındırasan!* M.Əliyev.

**ÇƏNGLİK** *is.* Çəngolma, qıcolma; epilepsiya. *Çənglik tutması zamanı xəstə çox zaman dilini dişləyir. Belə tutmalar çox ağır şəkildə keçir.* "Sağlam məişət uğrunda".

**ÇƏNLƏŞMƏ** "Çənləşmək"dən *f.is.*

**ÇƏNLƏŞMƏK** *f.* Çən olmaq, çən basmaq, duman basmaq, sis basmaq, dumanlanmaq (b a x **çən**[2]). *Gecə-gündüz tənləşir; Hava hərdən çənləşir.* A.Səhhət.

**ÇƏNLİ** *sif.* Çən olan, çən basmış, dumanlı, sisli. *Çənli bir payız səhəri idi.* H.Nəzərli. *Yadındamı, tutqun, çənli bir səhər; Göygözlü oğlunu düşmən apardı.* R.Rza.

**ÇƏP** *is.* və *sif.* [*fars.*] 1. Bəbəkləri eyni istiqamətə baxmayan (göz haqqında). [Fərəc bəy:] *Mənə əyri-əyri baxır, çəp gözünü qıyır, lopa bığlarının ucunu ağzına salıb gəmirir..* Ə.Vəliyev.

2. Sol (*rast* əksi). *Çəp əl.*

◊ **Sözü çəp gəlmək** – mübahisə etmək, razılığa gələ bilməmək. *Sözləri çəpləşən kənd cavanları burada çox yumruq davasına çıxıb bir-birinin üstünə xəncər çəkmiş, bəzən də aralığa qan salmışdılar.* İ.Şıxlı.

**ÇƏPBUCAQLI** *sif.* Bucağı çəp və ya küt olan. *Çəpbucaqlı üçbucaq.*

**ÇƏP-ÇƏP** *zərf:* **çəp-çəp baxmaq** – şübhə ilə, qeyri-dostanə baxmaq. *Ona niyə belə çəp-çəp baxdın?*

**ÇƏPƏKİ** *zərf* [*fars.*] 1. Əyrisinə, əyri-əyri; yanakı, çəp, çəpəndazı. *Şoferin yanında çəpəki oturan prokuror sükutdan darıxaraq geri döndü.* İ.Şıxlı. *Fəridə güldü. Nərgiz isə ona çəpəki nəzər salıb qocaya dedi..* Ə.Məmmədxanlı.

2. Düzünə yox, çəpinə, əyrisinə; yanpörtü. [Əsgər:] *avtomat tüfəngini döşündən çəpəki asmışdı.* M.Hüseyn.

3. Yan tərəfə çevrilmiş halda, yan tərəfini irəli verərək, böyrünü qabağa verərək. *Çəpəki oturmaq.* // Bir qulağının üstünə, başının bir tərəfinə çəkərək; yanakı. *Papağı çəpəki qoymaq.*

**ÇƏPƏL** *is. dan.* Həyasız, utanmaz. [Nənə dedi:] *Bala, bu çəpəl səni aldadır, getmə.* (Nağıl). *Qonşuynan dalaşar, uşağı döyər; Kəsən yoxdu bu çəpəlin dilini.* Aşıq Ələsgər.

**ÇƏPƏNDAZI** b a x **çəpəki** 1 və 2-ci mənalarda. *Qazı qarıya çəpəndazı baxıb soruşdu: – Bəs, sığallı xanım, bizim zəhmətimiz?* S.Rəhimov.

**ÇƏPƏR** *is.* 1. Bir yerin və ya bir şeyin ətrafına taxtadan və ya başqa materiallardan çəkilən divar, barı; hasar. *Həyətin ətrafına çəpər çəkmək. – Qapıda, pilləkənlərdə, tikinti üçün çəkilmiş taxta çəpərlər arasında danışıq başlandı.* Mir Cəlal. *Məftil çəpərləri qıra bilən xalq; Bir il gec, bir il tez – qıracaq yenə.* B.Vahabzadə. *Döngələri necə buralduğunu çəpərlərdən necə aşdığını, körpünü nə vaxt keçdiyini bilmədi. Qapını taybatay açıb içəri girdi.* İ.Şıxlı.

2. Bostanda əkini küləkdən qorumaq üçün ləklərin arasında tikan və s.-dən çəkilən sədd. *Tikan çəpər.*

**ÇƏPƏRLƏMƏ** "Çəpərləmək"dən *f.is.*

**ÇƏPƏRLƏMƏK** *f.* Çəpər çəkmək, çəpər düzəltmək. *Bostanı çəpərləmək. – Sahəni mümkün olduğu qədər tez çəpərləmək lazımdır*. "Çay bitkisi".

**ÇƏPƏRLƏNMƏ** "Çəpərlənmək"dən *f.is*.

**ÇƏPƏRLƏNMƏK** *məch*. Çəpər çəkilmək, çəpər düzəldilmək, çəpər içərisinə alınmaq. *Həyətin ətrafı çəpərləndi*.

**ÇƏPƏRLƏNMİŞ** *f.sif*. Çəpər çəkilmiş, çəpər içərisinə alınmış. *Yalnız bir ağılın qabağında, dövrəsi qamışdan çəpərlənmiş meydançada bir neçə körpə quzu mələşirdi.* M.İbrahimov.

**ÇƏPƏRLİ** *sif*. Çəpəri olan, ətrafına çəpər çəkilmiş, çəpərə alınmış. *Ələmdar qalın çəpərli həyətinə girib, qəzəblə arvadını səslədi: – Bənövşə, Bənövşə!* S.Rəhimov.

**ÇƏPGÖZ** *sif*. Gözləri çəp olan. *Molla evlənib, çəpgöz bir arvad alır.* "M.N.lətif.".

**ÇƏPGÖZLÜK** *is*. Bəbəklərin müxtəlif istiqamətdə olmasından ibarət göz xəstəliyi.

**ÇƏPİK**[1] *is*. Alqış, əl çalmaq. ☐ **Çəpik çalmaq** – alqış əlaməti olaraq əllərini bir-birinə vurmaq, əl çalmaq. *..Bəylər də qaqqıldaya-qaqqıldaya qızların oynamağına çəpik çalırdılar.* C.Məmmədquluzadə. *Yallı gedir ağacları, çəpik çalır yarpaqları.* M.Müşfiq.

**ÇƏPİK**[2] *is*. ["çevik" sözünün təhrif edilmiş forması] Zirək, diribaş.

**ÇƏPİNƏ** bax **çəpəki** 2-ci mənada.

**ÇƏPİŞ** *is*. Altı ayını keçməmiş keçi balası, oğlaq. *Burada sarı və boz kərə, qumral, əbrəş, qaşqa quzular və ağlı-qaralı çəpişlər bir-birinə qarışmışdı.* M.İbrahimov. *Ağ mayaların üstündə oturub yayxana-yayxana gedən qoca qarıların qucağında balaq, çəpiş, it küçüyü gözə dəyirdi.* Ə.Vəliyev.

**ÇƏPKƏN** *is*. Qolları çapıq, qıraqları baftatı, astarlı qadın geyimi. *..Süzülüb sallanan kələğayı* [Kiçikbəyimin] *incə vücudunun bir tərəfini tutmuş, çəhrayı çəpkəninin ancaq bir qolu görünürdü.* Çəmənzəminli. *Dul arvadın vurtut əynində köhnə bir çəpkəni, nimdaş bir tumanı .. var idi.* Ə.Vəliyev.

**ÇƏPLƏŞMƏ** "Çəpləşmək"dən *f.is*.

**ÇƏPLƏŞMƏK** *qarş*. Sözləri düz gəlməmək, aralarında ədavət əmələ gəlmək. *Qardaşlar çəpləşdilər, dava-şava gücləndi.* S.Rəhimov. [Rüstəmdə] *yorğun olanda və ya birisi ilə çəpləşəndə trubkanı sümürüb, stəkanda buğlanan çaya baxaraq fikrə getmək başqa bir aləm idi.* M.İbrahimov.

**ÇƏPMİL(Lİ)** *sif*. Milləri, xətləri düzünə deyil, çəpinə olan. *Çəpmil dəftər.*

**ÇƏR** *is. bayt*. Tərləmiş atı sulamaq nəticəsində onda əmələ gələn revmatizm iltihabı. *Atlar sakit-sakit uzanıb yatır; Bəzisi saqqodur, bəzisi də çər.* B.Vahabzadə.

**ÇƏRÇİ** *is. köhn*. Gəzərək xırda alver edən adam, gəzərgi alverçi; xırdavatçı. [Mirzə Əliməmməd Səfərə:] *Pul verərəm, bir az mal alarsan, çərçi sifətilə gedərsən, sata-sata camaata qarışıb əhval tutarsan..* Çəmənzəminli. [Əmiraslan baba dedi:] *O zaman* [Ağbulaq kəndini] *ya çiynixurcunlu balacaboylu bir çərçi, ya da uzunqulaqyüklü, ucaboylu bir çərçi tanıyardı!* S.Rəhimov.

**ÇƏRÇİLİK** *is*. 1. *köhn*. Çərçinin işi, peşəsi; xırdavatçılıq. [Hacı Mehdi:] *Get bazara, çərçiliyini elə, beş şahı qazan, ətə, çörəyə ver, gətir ye, yıxıl yat.* Ə.Haqverdiyev.

2. *məc. dan*. Boşboğazlıq, laqqırtı. *Bəsdir çərçilik elədin.*

**ÇƏRÇİVƏ** *is*. [*fars*. çəhar çubə – dörd ağac] 1. Bir şeyi çərçivələmək, keçirmək üçün taxtadan və s.-dən qayrılmış dördbucaq və ya oval formada kənarlıq, qəfəs. *Pəncərənin çərçivəsi. Alüminium çərçivə. – Qapı çərçivəyə bərk dəydiyindən geri dönüb yarımaçıq qaldı.* M.İbrahimov. *Alaqapının çərçivəsində elektrik zəngi düyməsi vardı.* M.Rzaquluzadə.

2. Şəkil, yazı, güzgü kimi şeyləri bəzəmək və asıla biləcək bir hala salmaq üçün onların kənarlarına taxılan kənarlıq; haşiyə. *Bahalı bir çərçivədə 50 yaşlarında gözəl, ziyalı paltarı geyinmiş bir kişi şəkli vardı.* C.Cabbarlı. [Nizami:] *Mən heç bir zaman Azərbaycan xalqının böyük varlığını Araz çayı ilə Kür çayı arasındakı dar bir çərçivəyə soxmaq istəyənlərə vətənpərəst deməyəcəyəm.* M.S.Ordubadi. *Bizi dünyanın o dar çərçivəsindən çıxarır; Dəli xallardakı hönkürtüyə dalmaqla Segah.* B.Vahabzadə.

3. *xüs*. Maşının, qurğunun, konstruksiyanın əsas hissəsi; rama. *Avtomaşının çərçivəsi. – Qaldırıcı val çərçivənin dayaqları üstün-*

*də qoyulmuş iki yastıq üzərində oturur.* S.Quliyev.

4. *məc.* Bir şeyin həddi-hüdudu. *Kitabın cildində qara çərçivə içərisində döşdən yuxarı çəkilmiş bir adam şəkli vardı.* M.İbrahimov.

**ÇƏRÇİVƏLƏMƏ** "Çərçivələmək"dən *f.is.*

**ÇƏRÇİVƏLƏMƏK** *f.* Çərçivəyə salmaq, çərçivəyə yerləşdirmək; haşiyələmək. *Şəkli çərçivələmək.*

**ÇƏRÇİVƏLİ** *sif.* Çərçivəyə salınmış, çərçivəsi olan; haşiyələnmiş. *Çərçivəli şəkil.* – *Kəllə divarda böyük çərçivəli Rza şahın əksi asılmışdı.* M.İbrahimov.

**ÇƏRDƏK** b a x **çəyirdək**. *Kərim duruxdu, az qaldı ki, zoğal çərdəyi boğazına getsin.* Ə.Vəliyev.

**ÇƏRDƏKLİ** b a x **çəyirdəkli**.

**ÇƏRDƏKSİZ** b a x **çəyirdəksiz**. *Çərdəksiz meyvə.*

**ÇƏRDƏYMİŞ** *is.* Əsil mənası "çər xəstəliyinə tutulmuş" olub, ev heyvanları haqqında yüngül qarğış kimi işlədilir. [Molla:] *Vallah, çoxdandır ki, minməmişəm, amma çərdəymiş buzov vaxtında elə yaman qaçağan idi.* "M.N.lətif." [Həsən:] *Budur, tamam bir ildir, deyirəm, aparım, bu çərdəymişi satım.* Ə.Haqverdiyev.

**ÇƏRƏK** *is.* [*fars.* çəhar yek – dörddə bir] 1. Arşının dörddə birinə bərabər uzunluq ölçüsü (17,75 sm). *Təndirlə üzbəüz divarın içində beş çərək enində üç arşın hündürlüyü olan suaxan görmək olardı.* H.Sarabski. *Nə məhəbbət, nə sədaqət tərəzidə çəkilməz; Hər ikisi ölçülməyib parça kimi çərəklə.* S.Rüstəm. *"Oğlum ölsün" – deyərək, yalandan min dil tökən; Hər arşına üç çərək sürüşdürən taciri.* M.Müşfiq.

2. Girvənkənin dörddə birinə bərabər ağırlıq ölçüsü (100 qr).

3. Dörddə bir. *Ölçü vahidi bütöv, yarım, çərək, səkkizlik və onaltılıq ola bilər.* "İbtidai musiqi nəzəriyyəsi".

4. "Bir" sayı ilə: **bir çərək** – bir az, bir tikə, azacıq. *Yox, gərək bir çərək; Qalmasın boş yerin!* M.Müşfiq. *Qız ayağını bircə çərək qabağa qoysaydı, uçacaqdı gölə.* İ.Məlikzadə.

**ÇƏRƏKƏ** *is.* [*fars.*] *köhn.* Keçmişdə: mollaxanalarda ərəb əlifbasını öyrənmək üçün dərslik, əlifba kitabı. *Amma Xəlil özü bir küncdə əyləşib əlində çərəkəsi, diqqəti tamamilə dərsini əzbərləməkdədir.* Ə.Haqverdiyev. *O zamanın təhsili də elə bundan ibarət idi: çərəkədən sonra ərəbcə Quran oxuyurdular, sonra fars klassikləri keçilirdi.* Çəmənzəminli. // *din.* Yasin, təlqin və s. yazılmış kitabça. *Mollalar hazır olur dəfninə əldə çərəkə.* M.Ə.Sabir. // Şeir, yaxud mərsiyə dəftərçəsi; bayaz.

**ÇƏRƏN** b a x **çərən-pərən**. *Qarı nənənin sözlərini sanma çərəndir! Canım, gözüm, ay qız!* M.Ə.Sabir.

**ÇƏRƏNÇİ** *sif.* və *is.* Boş-boş danışan; naqqal. *Çərənçinin biridir.*

**ÇƏRƏNÇİLİK** *is.* Boş-boş danışma; naqqallıq. [Paşa bəy:] *Fərrux! Kimə etibar eləyirsən, kimə inanırsan, hamısını işə qoş, daha çərənçiliklə məşğul olma!* Ə.Vəliyev.

**ÇƏRƏNDƏYMİŞ** b a x **çərdəymiş**. [Koroğlu dedi:] *Paşa sağ olsun, o Koroğlunun bir çərəndəymiş atı var.* "Koroğlu".

**ÇƏRƏNLƏMƏ** "Çərənləmək"dən *f.is.*

**ÇƏRƏNLƏMƏK** *f.* Boş-boş danışmaq, çərən-pərən danışmaq. [Hacı Murad:] *Di itil get! Yenə çərənnəməyə başlama!* S.S.Axundov. [Pirqulu Səlimə:] *Daha sən də bəsdir çərənlədin.* C.Cabbarlı.

**ÇƏRƏN-PƏRƏN** *is.* Boş danışıq, cəfəngiyat, tartan-partan. [Sultan:] *Çərən-pərənə qulaq asmaq üçün mənim vaxtım yoxdur.* İ.Hüseynov. ☐ **Çərən-pərən danışmaq** – b a x **çərənləmək**. *..Dumada danışmaq nəyə lazımdı? O qədər orada çərən-pərən danışan var ki..* C.Məmmədquluzadə.

**ÇƏRƏZ** *is.* Adətən, xörəkdən sonra yeyilən quru meyvə, xuşgəbar, şirniyyat şeyləri, desert. *Mirzənin cibləri çərəzdən boş olmazdı.* Ə.Haqverdiyev. *Gözəl indi Həbibin ətrafında bərk hərlənirdi. Onun qabağına təzə dəmlənmiş çay qoydu. Stolun üstünə müxtəlif çərəz tökdü.* Ə.Vəliyev.

**ÇƏRX** *is.* [*fars.*] 1. B a x **çarx**. *Cırıldayan arabanın çərxləri; Qazmış yolu, yerdə qalmış əsəri.* A.Səhhət. *Toplar öz atəşləri və çərxlərilə durmadan manevr edirdilər.* Ə.Məmmədxanlı.

2. *məc.* Dünya, fələk. *Tən etmə ki, çərx bivəfadır; Daim işi cövr ilə cəfadır.* Füzuli. [Sitarə:] *Lənət bu çərxə, gərdişi kim cabəcamıdır?*

C.Cabbarlı. ◻ **Çərxi-dövran** *klas.* – dünya, kainat, fələk. *Çərxi-dövranın müəlla iltifatındanmı bu; Cəmi-ömrüm görmədim heç bir zaman məmlu səni?!* M.Müşfiq. *Ürəyində ağrı, gözündə həsrət; O, lənət yağdırdı çərxi-dövrana.* B.Vahabzadə.

**ÇƏRİ** *is. qəd.* Qoşun, ordu. *Xotkar üstümüzə çəri buyurdu; Döyüşərəm, dönmənəm, edərəm cəngi.* "Koroğlu".

**ÇƏRKƏZ** *is.* Qaraçay-Çərkəz muxtar vilayətində yaşayan xalqlardan biri.

**ÇƏRKƏZCƏ** *sif.* və *zərf* Çərkəz dilində. *Çərkəzcə danışmaq.*

**ÇƏRKƏZİ** *is. etnoqr.* Qafqaz xalqlarının geydikləri döşü vəznəli uzun kişi geyimi (milli paltarı). [Murad bəy:] *Hərdənbir çərkəzisini geyib, qızıl vəznələrini də taxırdı.* Qantəmir. // Sif. mənasında. [Leylək] *qoltuqçunun çiynindəki paltonu götürüb, nazik ləzgi şalından tikdirdiyi boz çərkəzi çuxasının üstündən geydi..* S.Rəhimov. ◻ **Çərkəzi papaq** – qaragül dərisindən yuxarı tərəfi enli papaq.

**ÇƏRLƏMƏ** "Çərləmək"dən *f.is.*

**ÇƏRLƏMƏK** *f.* 1. Çər xəstəliyi tutmaq (bax **çər**). *At çərləmişdir. Bu saat atdan qan almaq lazımdır.* Ə.Vəliyev.

2. Bezmək, usanmaq, təngə gəlmək, cana gəlmək, bıqmaq (danışıqdan, söhbətdən).

**ÇƏRLƏNMƏ** "Çərlənmək"dən *f.is.*

**ÇƏRLƏNMƏK** *f.* 1. Çər xəstəliyinə tutulmaq (bax **çər**). *At çərləndi.*

2. Bezmək, usanmaq, təngə gəlmək, bıqmaq.

**ÇƏRLƏTMƏ** "Çərlətmək"dən *f.is.*

**ÇƏRLƏTMƏK** *f.* Bezikdirmək, usandırmaq, cana gətirmək, təngə gətirmək, canını üzmək. *Bilməm nə çarə eyləyim, ay Molla Nəsrəddin! Çərlətdi lap məni bizim övrət, gavur qızı.* M.Ə.Sabir. [Bərbərzadə:] *Məni qocaltdınız, daha bəsdir, məni çərlətdiniz, daha bəsdir.* S.Rəhman.

**ÇƏRMƏKİ** *is.* Gönü döyüb yastılamaq üçün alət, çəkic. *Çəkməçilər önündə döşlük, əldə çərməki, ayaqyalın çıxmışdılar.* Mir Cəlal.

**ÇƏRPƏLƏNG** *məh.* bax **badban**.

**ÇƏRŞƏNBƏ** *is.* [*fars.*] Həftənin üçüncü günü, çərşənbə axşamından sonra gələn gün. *Çərşənbə günündə çeşmə başında; Gözüm bir alagöz xanıma düşdü.* Aşıq Ələsgər. ◻ **Çərşənbə axşamı** – həftənin ikinci günü, tək günü.

**ÇƏRTİK** *is.* Çərtilmiş yer. ◻ **Çərtik açmaq** – bax **çərtmək** 2-ci mənada.

**ÇƏRTİKLƏMƏ** "Çərtikləmək"dən *f.is.*

**ÇƏRTİKLƏMƏK** *f.* Çərtik açmaq.

**ÇƏRTİLMƏ** "Çərtilmək"dən *f.is.*

**ÇƏRTİLMƏK** *məch.* 1. Bıçaq və s. iti alətin ucu ilə üstü azacıq kəsilmək.

2. Yonulmaq. *Dəmirov .. bir dəstə çərtilmiş* (f.sif.) *karandaşı qabağına qoyduqdan sonra kresloya əyləşdi.* Ə.Sadıq.

**ÇƏRTMƏ** 1. "Çərtmək"dən *f.is.*

2. Taxtanın, ağacın, metalın və s.-nin səthindən itiuclu alətlə azacıq kəsib götürmə; kərtik. *Sırğa və qolbaqların bəzəyində .. döymə, çərtmə üsullarından geniş istifadə olunur.* "Elm və həyat".

**ÇƏRTMƏK** *f.* 1. İti bıçağın və ya başqa iti alətin ucu ilə yaranın və s.-nin üstünü azacıq kəsmək. *Həkim yaranı çərtib, irini çıxardı. – Məhərrəmlikdə kərbəlayı altıaylıq uşaqların başını çərtirdi..* Çəmənzəminli. // Keçmişdə: qan almaq və b. məqsədlə bədənin bir yerini iti bıçağın ucu ilə azacıq kəsmək.

2. Misgərlik, zərgərlik və b. sənətlərdə xüsusi alətlə çərtik açmaq.

3. Yonmaq, ucunu itiləmək. *Karandaşı çərtmək.* – [Salmanov:] *Mən heç yazmağa başlamamışam. Bayaqdan qələmi çərtirdim.* S.Rəhman.

4. *məc.* Üstüörtülü danışmaqla sataşmaq, toxunaqlı söz atmaq; sancmaq. [Mirbalayev:] *İkincisi də .. o nə sözdür, çərtirsən?* İ.Hüseynov.

**ÇƏTƏ** *is.* [*alb.*] Qeyri-müəyyən silahlı dəstə.

**ÇƏTƏÇİ** *is.* Çətə iştirakçısı.

**ÇƏTƏN** *is. məh.* Qarğıdan, ağac çubuqlarından hörülmüş çəpər, hörgü. [Tubu:] *Orada, çətənin dalında göydən asılıb.* Ə.Haqverdiyev. *Qəhrəmanlar camaatı bir zamanlar bu qarğılardan qırıb çətən toxuyar, dəyələrin və alaçıqların ətrafına çəkərdilər.* Ə.Vəliyev. ◻ **Bir çətən** – çoxluq bildirir. [Gülsənəm:] *..Hümmətəlinin bir çətən külfəti var.* M.Hüseyn. [Zeyni baba:] [Azər] *görmüşdü, bir çətən külfətim vardı.* Ə.Məmmədxanlı.

**ÇƏTƏNƏ** *is. bot.* Saplağından kəndir, tumlarından yağ hazırlanan birillik ot bitkisi. *Çay qırağı çətənə; Gül göndərdim vətənə. Allah qismət eləsin? Öz könlümə yatana.* (Bayatı). □ **Çətənə qoz** *bot.* – qabığı çox bərk olan və ləpəsi çətinliklə qabığından çıxarıla bilən qoz. *Qoz sortları meyvə qabığının bərkliyinə görə üç cür olur: yumşaq və ya nazikqabıqlı – buna kağızı qoz, qabığı orta bərklikdə olana kirkit qoz, qabığı çox bərk olana isə çətənə qoz deyirlər.* İ.Axundzadə.

**ÇƏTİN** *sif.* İcrası, həyata keçirilməsi, aradan qaldırılması, həlli, başa düşülməsi və s. çox böyük zəhmət, səy, gərginlik tələb edən (*asan* ziddi). *Çətin iş. Çətin vəzifə. Çətin imtahan.* – [Nuriyyə:] *Ən çətin məsələ-misallar seçib həll elədim.* İ.Əfəndiyev. *Osa mənə öyrədib təbiətin dilini; Onun sirli dilini, çətin dilini.* B.Vahabzadə. // *zərf* Çətinliklə başa gələn; ağır (*asan* ziddi). *Çətin nəfəs almaq. Çətin həzm olunan qidalar.* // Çox ağır, dözülməz. *Çətin vəziyyət. Çətin şərait. – Çocuqlarından ayrılmaq nə qədər çətin, nə qədər ağır idi.* S.Hüseyn.

◊ **Çətinə düşmək** – ağır, çıxılmaz vəziyyətə düşmək, dara düşmək. [Fərhad Mustafaya:] *Əgər çətinə düşsən, Əsgəran atlı bölüyündəki yoldaşlara müraciət edərsən.* Ə.Məmmədxanlı. [Qarovul:] *Bir xan ki öz rəiyyətini qaramal kimi sata, o, rəiyyət məhəbbətini qazanamı bilər ki, çətinə də düşəndə rəiyyət onun arxasında dursun?* Ə.Haqverdiyev. **Çətinə salmaq** – çətin vəziyyətə salmaq, işini daha da çətinləşdirmək, dara salmaq. *Elə bil Nərgiz özü də qocanı bir qədər çətinə saldığını duyaraq ondan soruşdu.* Ə.Məmmədxanlı. *Mən bədbəxti taleyim yaman saldı çətinə..* B.Vahabzadə.

**çətin...** Bir sıra mürəkkəb feli sifətlərin birinci tərkib hissəsi olub, onların ifadə etdiyi şeyin çətin, mürəkkəb olduğunu bildirir; məs.: çətinəriyən (metal), çətinoxunan (kitab), çətinsayılan (mal).

**ÇƏTİNLƏŞDİRİLMƏ** "Çətinləşdirilmək"dən *f.is.*

**ÇƏTİNLƏŞDİRİLMƏK** *məch.* Daha da çətin edilmək, ağırlaşdırılmaq.

**ÇƏTİNLƏŞDİRMƏ** "Çətinləşdirmək"dən *f.is.*

**ÇƏTİNLƏŞDİRMƏK** *f.* 1. Daha da çətin etmək; ağırlaşdırmaq. *Bürkü tənəffüsü daha da çətinləşdirir.*

2. Daha da ağırlaşdırmaq, mürəkkəbləşdirmək, çətin etmək. *İşi çətinləşdirmək.*

**ÇƏTİNLƏŞMƏ** "Çətinləşmək"dən *f.is.*

**ÇƏTİNLƏŞMƏK** *f.* Daha da çətin olmaq; ağırlaşmaq. [Ələkbər:] *İşlər günbəgün çətinləşir.* Ə.Haqverdiyev. *Səlimin vəziyyəti yamanca çətinləşdi.* B.Bayramov.

**ÇƏTİNLİK** *is.* 1. Çətin şeyin halı; çətin olma (*asanlıq* ziddi). *Yolun çətinliyi. Məsələnin çətinliyi. – Səba xanım adəti üzrə vəzifəsində çətinlik hiss edən adamlar kimi boynunu çiyninə qoyaraq: – Əlacım nədir.* M.S.Ordubadi. [Cahan:] *Xalan sənə* [Əsgərə] *qurban, evlənmək su içmək kimi asan şeydir, onda nə çətinlik var ki?* Ü.Hacıbəyov. □ **Çətinlik çəkmək** – öhdəsindən zorla gəlmək, bir şeyi yerinə yetirməkdə, görməkdə əziyyət çəkmək. *Leylək qızılın hamısını hesab etməkdə çox çətinlik çəkdi.* S.Rəhimov. **Çətinliyə düşmək** – b a x **çətinə düşmək**. **Çətinliyə salmaq** – b a x **çətinə salmaq**.

2. Maneə, əngəl. *Çətinlikdən qorxmamaq. – Həyatın başlanğıcında daima bir çətinlik vardır.* M.S.Ordubadi. *İlk çətinlik asfalt yoldan həmin kəndə sarı döndüyümüz zaman meydana çıxdı.* M.Rzaquluzadə.

3. Məhrumiyyət, əziyyət, məşəqqət. *..Uşağı həyatın çətinliyinə hazırlamaq lazımdır.* S.Rəhimov. [Həsən] *çətinliklərə də dözərdi*. M.İbrahimov. □ **Çətinlik çəkmək** – maddi ehtiyac içərisində olmaq, məhrumiyyət duymaq.

**4**. **Çətinliklə** şəklində *zərf* – böyük zəhmətlə, əziyyətlə, çox çətin. *Axund çətinliklə durub başını bulaya-bulaya keçir o biri otağa.* Ə.Haqverdiyev. *Teymur müəllim çox çətinliklə Fərmanı bu fikrindən vaz keçirməyə müvəffəq oldu.* Ə.Sadıq.

**ÇƏTİR** *is.* 1. Günəşdən, yağışdan qorunmaq üçün əllə baş üstündə tutulan günlük; yağmurluq, zontik. *Onların gözündə nə rəngli eynək; Nə də başlarında əlvan çətir var.* B.Vahabzadə. *Əlində alabəzək bir çətir olan qız maşına yaxınlaşdı.* H.Seyidbəyli. // *məc.* Obrazlı təşbehlərdə "örtü" mənasında. *Gecənin qara çətiri*

*altında kölgələnən hər bir şey qaranlığın yeknəsəq libasına bürünüb yatmışdı.* M.S.Ordubadi.

2. Kəsilib alına sallanan saç; tel. *Qızın çətiri. Çətir qoymaq.*

3. *xüs*. Paraşütün, hava dolduqda açılan parçadan ibarət əsas hissəsi. *Paraşütün çətiri. – Bunlar yaxınlaşdıqda nöqtələr böyüdü və qırmızı, yaşıl, sarı rəngli zolaq-zolaq çətirlərdən adamların sallana-sallana endikləri aşkar göründü.* M.Rzaquluzadə.

4. *bot.* Ağacın gövdədən yuxarıda budaqların yayıldığı yuxarı hissəsi. *Təbii ki, gövdəsi yoğun və çətiri geniş olan palıd ağacları öz həyatları üçün müəyyən ölçüdə sahə tələb edir.* M.F.Axundzadə.

**ÇƏTİRCİK** *is.* 1. Kiçik çətir, balaca zontik. *Uşaq çətirciyi.*

2. *bot.* Balaca çətiri olan (b a x **çətir** 4-cü mənada). *Tingin çətirciyi.*

**ÇƏTİRÇİÇƏKLİLƏR** *cəm. bot.* Çətirli çiçəkləri olan bitki fəsiləsi (b a x **çətirli** 2-ci mənada). *Keşniş birillik ot bitkisidir, çətirçiçəklilər fəsiləsinə aiddir.* "Elm və həyat".

**ÇƏTİRLİ** *sif.* 1. Çətiri olan; saçını çətir kimi kəsdirib alnına tökmüş. *Çətirli qız.*

2. *bot.* Çətiri (4-cü mənada) olan. *Zeytun bütün il müddətində gümüşü rəngdə yarpaqlarla örtülü olan sıx çətirli çoxillik meyvə bitkisidir.* İ.Axundzadə.

**ÇƏTVƏR** *is.* [*rus.* четверть] *köhn.* Metr sistemi tətbiqindən əvvəl 100 qrama bərabər ağırlıq ölçüsü. *Bir çətvər xına.*

**ÇƏYİRDƏK** *is. bot.* Alça, gavalı, albalı, zoğal və b. meyvələrin tumu. *Gülsüm xala uşağın ağzını əli ilə örtüb, üzündən üflərdi, sonra barmağını uşağın ağzına salıb, əzgil çəyirdəyindən, gavalı çəyirdəyindən, kömür qırığından çıxarardı.* Ə.Haqverdiyev.

**ÇƏYİRDƏKLİ** *sif.* Çəyirdəyi olan; tumlu. *Çəyirdəkli meyvələrə gilas, albalı, gavalı, alça, qaysı, hulu, şaftalı, zoğal və s. daxildir.*

**ÇƏYİRDƏKSİZ** *sif.* Çəyirdəyi olmayan; tumsuz. *Çəyirdəksiz meyvə.*

**ÇƏYİRTKƏ** *is. zool.* Cırcıramaya oxşayan, uzun dal ayaqlarına dayanaraq uzağa sıçraya bilən, böyük dəstələrlə uçub, bitkiləri və əkinləri məhv edən cücü – kənd təsərrüfatı üçün təhlükəli ziyanverici. *Çayın o tayındakı yoncalıqlarda çoxlu kəpənək və çəyirtkə vardı.* Ə.Vəliyev.

◊ **Çəyirtkə kimi** – bulud kimi, böyük kütlə halında bir şeyin üstünü alan canlılar haqqında.

**ÇIĞ** *is.* 1. Xırda qamış, qarğı.

2. Qarğı süzgəc; qarğıdan düzəldilmiş aşsüzən.

**ÇIĞIR-BAĞIR** *is.* Çığırtı, bağırtı, qışqırıq, hay-küy. [Hacı Mehdi:] *Mən sənin bu çığır-bağırından heç bir şey başa düşmürəm.* Ə.Haqverdiyev. [Qadınlar] *yalnız çığır-bağır salmaqla döyülən qadına yardım etmək istəyirdilər.* S.Hüseyn.

**ÇIĞIRĞAN** *sif. dan.* Çox çığıran; çığırmağa, bağırmağa, qışqırmağa adət etmiş. *Çığırğan adam.*

**ÇIĞIRIQ** b a x **çığırtı**. *Körpü sakit oldu, səs və hay-küy, çığırıq kəsildi.* T.Ş.Simurq.

**ÇIĞIRIŞMA** "Çığırışmaq"dan *f.is.*

**ÇIĞIRIŞMAQ** *qarş.* Bir ağızdan hamı çığırmaq, hamı birdən yerbəyerdən çığırmaq; bağırışmaq. *Arvad qışqırdı, uşaqlar çığırışdılar, məcməyi üzüqoylu çevrilib, dolmanın hərəsi evin bir küncünə diyirləndi.* Çəmənzəminli. *Kənd qızları bir-birini itələyir, zarafatlaşır, çığırışırdılar.* Ə.Vəliyev.

**ÇIĞIRMA** "Çığırmaq"dan *f.is.*

**ÇIĞIRMAQ** *f.* 1. Bərk qışqırmaq, bağırmaq. *Nə üçün çığırırsan? Çığırmaqdan səsi batdı. – Atalar doğru deyib: – Oğru elə çığırdı ki, doğrunun bağrı yarıldı.* Ə.Vəliyev. // Çığıra-çığıra demək, bərk səslə demək. *Polad çığırdı ki: – Mən bu dünyada; Yaşadım namusla, vicdanla ancaq.* M.Rahim.

2. Bərkdən ağlamaq, fəryad etmək, haray salmaq, bağırmaq. *Gördüm ki, bir balaca uşaq yıxılıb adamların ayağının altına, çığırır.* M.S.Ordubadi. *O biri otaqda yatmaqda olan Ruqiyyə xanımın körpəsi yuxudan ayılıb çığırmağa başladı.* S.Hüseyn. // Bərkdən özünəməxsus səs çıxartmaq (heyvanlar və quşlar haqqında). *Atlar daha da şiddətlə başladılar çığırmağa.* C.Məmmədquluzadə. *Hərdənbir kəndin üzərindən yanıqlı-yanıqlı çığıran* (f.is.) *durna dəstələri ötüb keçirdi.* Ə.Məmmədxanlı.

**ÇIĞIRTI** *is.* Bağırma, çığırıq səsi, qışqırıq, bağırtı. *Rüstəm kişi əlini dəstəyin üstünə*

*basaraq üzünü divara tutmuşdu ki, Telli arvadın çığırtısı raykomda eşidilməsin.* M.İbrahimov. [Güllünün] *diqqətini başı üzərindən uçan qaz dəstəsinin çığırtısı cəlb etdi.* H.Seyidbəyli.

**ÇIĞIRTMA[1]** *is.* Qızardılmış pomidor, badımcan və ya ət tikələrindən ibarət xörək (bəzən yumurta da vurulur). *Pomidor* (*badımcan*) *çığırtması.* – [Fərhad:] *Musa ilə ikimiz bir cücənin çığırtmasını bir çörək ilə doyunca yemişik.* Ə.Haqverdiyev. [Dilara] *xırdaca doğranmış pomidor və turş xiyarla bərabər, toyuq çığırtmasını səliqə ilə stolun üstünə düzdü.* M.Hüseyn.

**ÇIĞIRTMA[2]** "Çığırtmaq"dan *f.is.*

**ÇIĞIRTMAQ** *icb.* 1. Çığırmasına səbəb olmaq; bağırtmaq, qışqırtmaq.

2. Ağlatmaq, bağırtmaq. *Uşağı nə üçün çığırdırsan?*

**ÇIĞIRTMALIQ** *sif.* Çığırtmaya yarayan, çığırtma üçün. *Çığırtmalıq cücə.*

**ÇIĞLIQ** *is.* Fəryad, fəğan, şivən. *Ətrafda qarğaşalıq və çığlıq qopar.* H.Cavid.

**ÇIĞNAMAQ[1]** *f.* Qarğını ortasından yarmaq.

**ÇIĞNAMAQ[2]** *f.* Ayaqlamaq, tapdalamaq.

**ÇIXACAQ** *is.* Çıxılacaq yer, çıxış yeri, çıxış. *Binanın çıxacağı.* – *Bu qalanın bir girəcəyi, bir çıxacağı var idi.* S.Rəhimov. *Meşənin çıxacağında təzə tülu etmiş gün yuxudan oyanmış dilbər kimi üzümə güldü.* A.Divanbəyoğlu.

**ÇIXAN** *is. riyaz.* Çıxma əməlində: birinci ədəd (rəqəm); azalan.

**ÇIXAR** *is.* Xərc, məxaric, xərclənən miqdar (*gəlir* qarşılığı). *Kasıb çıxarını bilsə, geydiyi atlaz olar.* (Ata. sözü).

**ÇIXARICI** *is. xüs.* Çətin çıxan bir şeyi çıxarmaq üçün alət. *Lehmə nasosunun klapan yuvasını çıxarmaq üçün çıxarıcıdan .. istifadə olunur.* "Qazmada təhlükəsizlik texnikası".

**ÇIXARILMA** "Çıxarılmaq"dan *f.is.*

**ÇIXARILMAQ** "Çıxarmaq"dan *məch. Əsgərlik yaşında olan bəzi gənclər siyahıdan çıxarılmışdı.* S.Hüseyn. *Uzun çəkişmədən sonra Aslan bəy çıxarılacaq neftin otuz faizini Quluya verməyə razı oldu.* A.Şaiq.

**ÇIXARIŞ** *is.* 1. Hər hansı mətndən (sənəddən) eynilə köçürülmüş hissə. *Qərardan çıxarış. Çıxarışın məxəzini göstərmək.*

2. Çıxartmaq işi; çıxarma.

3. Texnoloji proses nəticəsində bir məhsuldan alınan başqa məhsul; ekstrakt. *Quşüzümü ekstraktı .. quşüzümü meyvələrindən alınan sulu çıxarışdır.* R.Əliyev.

**ÇIXAR(T)DIRMA** "Çıxar(t)dırmaq"dan *f.is.*

**ÇIXAR(T)DIRMAQ** "Çıxar(t)maq"dan *icb. İşdən çıxar*(*t*)*dırmaq. Mənzildən çıxar*(*t*)*dırmaq.*

**ÇIXAR(T)MA** "Çıxar(t)maq"dan *f.is.*

**ÇIXAR(T)MAQ** *f.* 1. Bir şeyi bir yerdən kənar etmək, xaric etmək, dışarıya atmaq. // Bir yerdən götürüb başqa yerə qoymaq. *Mebeli otaqdan çıxar*(*t*)*maq.* – [Mehriban] *vaxtın gec olmasına baxmayaraq, küçə balkonuna bir masa çıxarıb, süfrə düzəltdi.* S.Hüseyn.

2. Bir şeyin içərisində olan başqa bir şeyi oradan götürmək. *Cibindən pul çıxar*(*t*)*maq.* – [Qoca] *kisəsini cibindən çıxardı.* H.Nəzərli. *Şərəfoğlu stolun alt gözünü açdı, oradan işlətmədiyi üçün tozlanmış bir külqabı çıxardı.* M.İbrahimov.

3. İşdən, vəzifədən, məktəbdən və s.-dən xaric etmək; azad etmək. *Vəzifədən çıxar*(*t*)*maq.* – [Kərbəlayı:] *Sabah işdən çıxararlar, qalaram başıma döyə-döyə.* H.Nəzərli.

4. Qərar vermək, hökm vermək, təklif etmək. *Əlbəttə, dəlilsiz, sübutsuz, mühakiməsiz və məntiqsiz heç bir zaman ədalətli bir hökm çıxarmaq olmaz.* S.Rəhimov. *İclas öz-özünə dağıldı, heç bir qərar çıxarmadılar.* M.Hüseyn.

5. Paltarını, ayaqqabısını, papağını və s. kənar etmək; soyunmaq. *Papağını çıxar*(*t*)*maq.* – *Mirbağır ağa girir, başmaqlarını çıxardır, salam verir.* C.Məmmədquluzadə. *Nazlı əynindəki tünd-şabalıd rəngli ipək köynəyini çıxartdı.* S.Rəhman.

6. Bitdiyi, yapışdığı, girdiyi yerdən çəkərək kökü ilə birlikdə qoparmaq. *Ağrıyan dişi çıxar*(*t*)*maq. Şitil çıxar*(*t*)*maq.* – *..Çöplü çuxurun kolunu qırır, kötüyünü maşınlar çıxarırdı.* Ə.Vəliyev.

7. Təhlükəli yerdən uzaqlaşdırmaq, başqa, təhlükəsiz yerə köçürmək. *Bayram aşağı əyildi, yerə sərilmiş fəhlələrdən birini qucağına alıb ortadan çıxartdı..* M.Hüseyn. *Zəhra Məmmədova o gecə 25 yaralını silahları ilə bərabər döyüş meydanından çıxartdı.* Ə.Vəliyev.

8. Zorla olduğu yerdən çıxmağa məcbur etmək; qovmaq. *Sürünü əkin yerindən çıxar*(*t*)*maq. – Yazıq Hacı Mirzə Həsən ağa, niyə səni qatır üstə mindirib, Təbrizdən çıxardıb qovdular?* C.Məmmədquluzadə. *Mirzə Qədir evindəki kirəçilərdən heç birini dışarı çıxara bilməyəcəkdi.* S.Hüseyn.

9. Müvəqqəti olaraq yaşadığı yerdən başqa yerə aparmaq. *Uşaqları yayda şəhərdən çıxar*(*t*)*maq. – Yaz gəlmişdi, Qəhrəman ailəsini bir yana çıxarmaq barəsində düşünürdü.* S.Rəhimov.

10. Nəşr etmək, çap etmək, buraxmaq. *C.Məmmədquluzadənin təsvirinə və tarixi sənədlərə görə o zaman Azərbaycan dilində qəzet çıxarmaq çox çətin məsələ imiş.* M.İbrahimov.

11. Yerin altından istehsal etmək. *Neft* (*qaz*) *çıxar*(*t*)*maq. – Atam gümüş çıxardığı halda, qızına bir gümüş medalyon da ala bilməmişdi.* S.Vəliyev.

12. Yara, səpmə və s. əmələ gəlmək. *Çiban çıxar*(*t*)*maq. Yara çıxar*(*t*)*maq. – Amma sonra haman uşaq çiçək çıxardır.* C.Məmmədquluzadə.

13. Hündür bir yerə qaldırmaq, aparmaq. *Şiferləri dama çıxar*(*t*)*maq.*

14. *dan.* Oynamaq, göstərmək, nümayiş etdirmək. *Qədim vaxtlarda komediyanı yunanilər gülüş üçün çıxardırdılar.* N.Nərimanov.

15. Atmaq, pozmaq, qaralamaq. *Əlyazmasının beşinci abzasını çıxar*(*t*)*maq.*

16. *dan.* Boşamaq, ayrılmaq. *Arvadını çıxarmaq.*

17. Bir sıra sözlərin yanına gətirilərək, müxtəlif ifadələr və mürəkkəb feillər düzəldilir; məs:. təmizə çıxar(t)maq, əldən çıxar(t)maq, ad çıxar(t)maq, oyun çıxar(t)maq, yaddan çıxar(t)maq.

**ÇIXDAŞ** *is.* Pis, keyfiyyətsiz, zay mal; nöqsanı, zədəsi olan məhsul; brak.

**ÇIXDAŞÇI** *is.* Pis, keyfiyyətsiz malı yaxşısından ayıran fəhlə.

**ÇIXIQ** 1. *is.* Oynaqda sümüklərin yerindən oynaması. *İmamverdi baba bilirdi ki, çıxığı yerinə tez salmaq lazımdır. Hərgah tez salınmasa yerinə ət gələr və sonra onu düzəltmək çətin olar.* S.S.Axundov.

2. *sif.* Yerindən çıxmış, yerindən oynamış. // İrəli çıxmış, qalxıq. *Zaman keçdikcə Güləbətinin üzünün çıxıq sümükləri görünməz olur, rəngi açılırdı.* M.İbrahimov. [Nuriyyə:] *Lakin Qulu Kəhrizli balaca çıxıq gözlərini gizli bir təbəssümlə oynadaraq birini İmi, digərini isə Cimi deyə, mənə təqdim etdi.* İ.Əfəndiyev.

**ÇIXILAN** *is. riyaz.* Çıxma əməlində: başqa ədəddən (rəqəmdən) çıxılacaq ədəd (rəqəm); ikinci ədəd (rəqəm).

**ÇIXILMAZ** *sif.* 1. Çıxmaq, qalxmaq çətin olan və ya mümkün olmayan. *Çıxılmaz dağ.* – [Aydəmir:] *Allah, özü bilir ki, o keçilməz meşələrdə, o çıxılmaz qayalarda Aydəmir bircə sənin xəyalınla yaşayır.* C.Cabbarlı.

2. *məc.* Ümidsiz, çarəsiz, əlacsız, içərisindən çıxmaq mümkün olmayan. *Fəxrəddin çıxılmaz bir vəziyyətdə qalmışdı.* M.S.Ordubadi. [Pakizə] *çıxılmaz bir vəziyyətdə idi.* A.Şaiq.

**ÇIXINTI** *is.* Bir şeyin irəli çıxmış, qalxıq hissəsi. *Qayanın çıxıntısı. Girinti və çıxıntı.*

**ÇIXIŞ** *is.* 1. Çıxmaq işi, çıxma. *Vasya tez-tez bayıra çıxıb, yenə qayıdırdı. Susanna bu çıxışın papiros çəkmək üçün olduğunu duyub dedi..* M.S.Ordubadi.

2. Çıxmaq üçün qapı, yol və s.; çıxacaq (*giriş* əksi). *Çıxışda gözləmək.* – [Usta] *..Tahiri yenə tapa bilməyib, kor-peşman qayıtdı, vağzalın çıxış yolunda dayandı.* M.Hüseyn.

3. İclasda və s.-də söylənilən nitq, məruzə, verilən məlumat və s. *Dartıb hədə-qorxu nazirlərinin; Yarımçıq saxlayaq çıxışlarını; Onların parlament alqışlarını.* M.Araz. ☐ **Çıxış etmək** – iclas və s.-də durub danışmaq, nitq və ya məruzə söyləmək, məlumat vermək. [Cəbrayıl Firəngizə:] *Müşavirədə kimlərin çıxış edəcəyi sizi maraqlandırırsa, siyahını verə bilərəm..* B.Bayramov.

4. Çıxma, doğma, doğuş, görünməyə başlama. *Ayın çıxışı.* – [Vaqif:] *..Günəşin çıxışı ilə batışı gözəl olur, günorta yerində olanda ona heç baxan da olmur.* Çəmənzəminli.

5. İdman və b. yarışlarda iştirak etmə; iştirak. *Boksçuların Beynəlxalq yarışlarda çıxışı.*

6. İfa etmə, göstərmə. *Mahnı və rəqs ansamblının çıxışı. – Günlərin birində Pavlo sirkdə çıxış edərkən nərdivandan yıxıldı.*

S.Vəliyev. // Artistin səhnəyə çıxması. *Rejissor* (*gərdün, yaxud şəbehgərdan*) *daim iştirak edənlər arasında gəzişərək, əlindəki əsa ilə hər kəsə öz çıxış vaxtını işarə edib bildirir.* Ə.Haqverdiyev. [Murad:] *Hüseyn, sənin çıxışındır, çıx!* S.Rəhman.

7. Nümayiş. // Öz tələbini, fikrini, münasibətini camaat, kütlə qarşısında bildirmə. *Həsənbəy Zərdabinin bu cəsarətli çıxışlarına qarşı irtica getdikcə güclənirdi.* M.İbrahimov. ☐ **Çıxış etmək** – öz tələbini, fikrini, münasibətini kütlə qarşısında çıxıb bildirmək. *Öz məqalələrində xalqın taleyi ilə yaşayan jurnalist* [Ü.Hacıbəyov] *daim xalq adından çıxış edir..* Ə.Sultanlı.

8. Göyərmə, cücərmə, bitmə. *Çıxışların batıqlara; Düşən xəfif kölgələri – Tağlardakı; Oyma "naxış ləpələri".* B.Vahabzadə.

◊ **Çıxış yolu** *məc.* – çıxılmaz vəziyyətdən, böhrandan qurtarmaq üçün çarə, yol, əlac, qurtuluş, nicat, xilas. *Qətibə çıxış yolu tapa bilmədiyindən, olduğu yerinə qayıtdı və həmişə oturduğu söyüd kötüyünün üstündə oturdu.* M.S.Ordubadi.

**ÇIXIŞLIQ: çıxışlıq hal** *qram.* – ismin kimdən? nədən? suallarına cavab verən halı.

**ÇIXMA** 1. "Çıxmaq"dan *f.is. Yarməmmədin otaqdan çıxması ilə sarı qovluğu qoltuğuna vurub qayıtması bir oldu.* M.İbrahimov.

2. Doğma, doğuş, tülu. *Ayın çıxması. – Mən sevirəm səhərlər; Günəşin çıxmasını.* N.Xəzri.

3. *riyaz*. Nəticə almaq üçün bir ədədi (rəqəmi) başqa bir ədəd (rəqəm) qədər azaltma. *Çıxma əməli. Toplama və çıxma.*

**ÇIXMAQ** *f.* 1. Bir yerdən (binadan, otaqdan və s.-dən) kənar olmaq, içəridən dışarıya varmaq, getmək, xaric olmaq. *Evdən çıxmaq. Kabinetdən çıxmaq. – Çay hazır olanadək mən özümə əlcəklər alım, – deyib Sona otaqdan çıxdı.* N.Nərimanov.

2. Bir yerə getməyə başlamaq, yola düşmək. *Qatar saat 2-də çıxır. – Əgər Şahmar bu gün çıxmasa, həm Nərminədən əli üzüləcək, həm də imtahanlara gecikəcəkdi.* B.Bayramov.

3. Doğmaq, tülu etmək, görünmək. *Gün çıxdı. – Çıxdı günəş, doldu cahan nur ilə; Cütçü sürür tarlada cüt şur ilə.* M.Ə.Sabir. *Yavaş-yavaş çıxmaqda olan Ay öz sarımtıl işığını ətrafa yayırdı.* M.İbrahimov.

4. Yuxarı qalxmaq, başıyuxarı getmək, qalxmaq. *Yuxarı mərtəbəyə çıxmaq. Yoxuşu çıxmaq. – Zeynal könülsüz addımlarla sakin olduğu evin pilləkənlərini yuxarı çıxırdı.* S.Hüseyn. *Xaspolad kəndin ortasındakı hündür təpəyə çıxdı.* M.Hüseyn.

5. Göyərmək, bitmək, yerdən çıxmaq, cücərtisi görünmək. *Pambıq yenicə çıxmışdı. – İndi əkdiklərin nə vaxt çıxar; Bu çıxınca səni zəmanə yıxar.* M.Ə.Sabir.

6. *riyaz.* Bir ədədi (rəqəmi) başqa bir ədəd (rəqəm) qədər azaltmaq. *10-dan 3 çıxmaq. – Hacı Kərim hər zaman alış-verişini nağd edər, faizini də verəcəyi puldan çıxardı.* S.Hüseyn.

7. İşini, vəzifəsini buraxmaq, tərk etmək, işlədiyi yerdən getmək, əlaqəsini kəsmək. *İşdən çıxmaq. Vəzifəsindən çıxmaq. – Atam ruhani idarəsindən çıxmağa məcbur olmuşdu.* A.Şaiq.

8. Öz işini görüb qurtararaq getmək, yerini tərk etmək. *Fərhad qulluqdan çıxanda daha bir yanda əylənməyir, tez evə qayıdırdı.* C.Cabbarlı.

9. Birdən-birə zahir olmaq, görünmək, qarşısına çıxmaq. *Yoluma bir maşın çıxdı. – Bağlar arası ilə uzanan bir yolla gedirdim. Bu halda qarşıma bir neçə çadralı qadın çıxdı.* S.Hüseyn.

10. Bir şeyin üstünə qalxmaq, dırmaşaraq qalxmaq. *Dama çıxmaq. Ağaca çıxmaq.* – [Tapdıq] *atasını incitməyə, onun çiyninə çıxmağa başladı.* Ə.Vəliyev. *Mühəndis təpənin üstünə çıxıb, qumu bir xeyli kürəklədi.* Mir Cəlal.

11. Müəyyən hündürlükdə olmaq. *Su döşə çıxır. – Palçıq çıxır qurşağa; Quzulamış səngərdə.* R.Rza.

12. Bir işi görmək üçün getmək, gəlmək. *İməcliyə çıxmaq. Ova çıxmaq.* – [Adil:] *Səhər tezdən alverə çıxan* (f.sif.) *kimi bir çarxçını küçədə əylədim.* B.Bayramov.

13. Qurtarmaq, sonu çatmaq, keçmək, ötmək. *Yaz çıxdı. Gecə çıxdı. – Qış yenicə çıxmış, yaz girmişdi.* M.İbrahimov.

14. Çap olunmaq, nəşr olunmaq, dərc edilmək, buraxılmaq. *"Molla Nəsrəddin" məcmuəsi 1906-cı ildən çıxmağa başlamışdır. Kitab bu ay çıxacaqdır. – Bir də ki,*

*Tahirzadənin əlindəki nüsxə təzəcə çıxmış, hələ də yayılmamışdı.* Mir Cəlal. *Canbalayevin isə ilk tənqidi məqalələri otuzuncu illərdə çıxmışdı.* İ.Hüseynov.

15. Təhlükəli, xətərli yerdən uzaqlaşmaq. *Bu gecə keçmişi vurduq, yıxdıq; Dağlardan üzə sağlam çıxdıq.* M.Müşfiq.

16. *məc.* Olmaq. [Gəray ağa:] *Yox, yox, nə* [Ağaxandan], *nə də məndən premyer çıxar!* S.Rəhimov.

17. Yerin altından hasil edilmək, əldə edilmək. *Respublikamızda yüksək keyfiyyətli neft çıxır. Sibirdə almaz çıxır. – Çayqırağındakı yamaclarda ev ağartmaq üçün göy rəngə çalan şirə .. çıxırdı.* Ə.Əbülhəsən. // İstehsal olunmaq, alınmaq. *Süddən yağ çıxır.*

18. Doğulmaq, törəmək, yetişmək, meydana gəlmək. *Şamaxıdan görkəmli şairlər çıxmışdır. Ailəmizdən iki mühəndis çıxmışdır.* – [Komandir:] *Mən özüm də kənddən çıxmışam, atamın da əli bax belə qabar-qabardır.* S.Rəhimov.

19. Yaşamaq, salamat qalmaq, müəyyən vaxta qədər sağ-salamat yaşamaq. *Yemsizlikdən qoyunlar yaza çıxmadı. – Seyyid, hanı şərabın, ötür fəsli-növbahar; Bir də baharə çıxmağının etibarı yox.* S.Ə.Şirvani. *Muzdurlar və yoxsullar dünənki gecəni bu günə qatıb, aprelin otuzuna çıxmışdılar.* Ə.Əbülhəsən.

20. İstehsal edilmək, buraxılmaq, hazırlanmaq. *Həmzə ilə Qadir də .. biri alman topçu tüfəngini, ikincisi isə .. alman zavodundan çıxmış* (f.sif.) *mauzerini gic yerə doldurur, boşaldırdılar.* Ə.Əbülhəsən.

21. Verilmək, qəbul olunmaq, elan edilmək. *Yeni qərar çıxdı. – Qayda belədir, həmişə manifest çıxanda ruznamələr onun məzmununu və mənasını camaata bildirirlər ki, hər bir kəs baxəbər olsun.* C.Məmmədquluzadə.

22. Boşanmaq, ərindən ayrılmaq. *Arvad ərindən çıxdı.* – [Bəhlul:] *Kişi bu şərtlə* [anamı] *aldı ki, "düşmənin uşağı"nı atıb çıxsın.* B.Bayramov.

23. İcad olunmaq, kəşf olunmaq, düzəldilmək, buraxılmaq. *Zavoddan yeni markalı maşın çıxdı. – Koroğlu demişkən: "Tüfəng çıxalı; Mərdlik də dünyadan baş aldı, getdi".* B.Vahabzadə.

24. Eşidilmək, qulağa gəlmək. *Səs çıxmaq. Hay-küy çıxmaq. – Qərənfiləm, qalxaram; Açılmağa qorxaram; Gecə cınqırın çıxsa; Yerimnən dik qalxaram.* (Bayatı). *Səttarzadə isə eşitdikləri ilə kifayətlənmirmiş kimi bir neçə dəfə çağırdı: alo! alo!.. Cavab çıxmadı.* Mir Cəlal.

25. Hesab etmək. [Qədir:] *Dirigözlü adamı öldüyə çıxırlar.* Mir Cəlal.

26. Bir sıra isimlərdən sonra gətirilərək, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: yoxa çıxmaq, əldən çıxmaq, yoldan çıxmaq, özündən çıxmaq, yaddan çıxmaq və s.

**ÇIXMAZ** b a x **çıxılmaz**.

**ÇIQQILDAMA** "Çıqqıldamaq"dan *f.sif.*

**ÇIQQILDAMAQ** *f.* Çıqqıltı səsi vermək, çıq-çıq eləmək. *Saat çıqqıldayır. – Daşlara toxunan nallar çıqqıldayırdı.* S.Rəhimov. *İri mis kəfgir ağır-ağır çıqqıldayırdı.* Q.İlkin.

**ÇIQQILDATMA** "Çıqqıldatmaq"dan *f.sif.*

**ÇIQQILDATMAQ** *f.* Bir şeyi bir şeyə toxunduraraq çıqqıltı səsi çıxarmaq, belə bir səsin çıxmasına səbəb olmaq. *Tahir .. divardakı elektrik açarına yanaşdı, onu sol əlilə bir-iki dəfə çıqqıldatdı.* M.Hüseyn. *Fərman Qədir kişi ilə əl verəndə* [fotoqraf] *aparatını çıqqıldatdı.* Ə.Sadıq.

**ÇIQQILTI** *is.* Saat işlərkən və ya xırda şeylər bir-birinə toxunarkən çıxan səs. *Mollayev yenə təsbehini çıqqıltı ilə çevirməyə başladı.* M.Hüseyn. *Saat vurur divarda; Hər çıqqıltı bir saat.* B.Vahabzadə.

**ÇIL-ÇILPAQ** *sif.* və *zərf* 1. Tamamilə çılpaq, lüt. *Fatma gecənin yarısı çıl-çılpaq küçələrə düşüb, özünə sığınacaq yer arayır.* Çəmənzəminli.

2. *məc.* Qətiyyən ağac bitirməyən, tamamilə bitkisiz. *Çıl-çılpaq çöl.* – [Bayram kişi:] *..Qabaq oralar dümdüz şoranlıq, bağrı çatlaq-çatlaq olmuş, çıl-çılpaq, quraq yerlərdi.* M.Rzaquluzadə.

**ÇIL-ÇIRPI** b a x **çırpı**. [Ovçular] *çıl-çırpıdan, otlardan qayırdıqları kiçik daxmalarda gizlənib, sümsünü çalardılar.* A.Şaiq.

**ÇILDAQ** *is.* Dini müalicə üsulu. *Çıldağa getmək.*

**ÇILDAQLAMA** "Çıldaqlamaq"dan *f.is.*

**ÇILDAQLAMAQ** *f.* Çıldaq etmək (b a x **çıldaq**). [Rəşid:] [Qorxmasına] *görə bina qoyulur ki, qızı K. kəndinə aparıb çıldaqlasınlar, qorxuluğunu götürsünlər.* T.Ş.Simurq.

**ÇILĞIN** *sif.* Coşqun, odlu-alovlu. *Çılğın dühalar ki hökm edər qərbə; Onlar səbəb olmuş bir geniş hərbə.* S.Vurğun. // Dəli kimi, dəlicəsinə, özünü itirmişcəsinə. [Məhəd] *dəli kimi çılğın bir hərəkətlə irəli şığıyıb, bağlamanı stolun üstündən qapmaq istədi.* M.Hüseyn. // *məc.* Qızğın, coşqun, ehtirasla dolu. *Baletmeyster dinamik rəngarəng və çılğın qaraçı rəqslərinin qurulmasında böyük səy göstərmişdir.* (Qəzetlərdən). // *məc.* Azğın, azğıncasına. *Çılğın kimi ruzgar vıyıldar; Qar parçaların göyə sovurar.* A.Şaiq. *Dənizdə tufan qalxır, Xəzərin ağköpüklü çılğın dalğaları sahili gəmirirdi.* M.Hüseyn.

**ÇILĞINCA(SINA)** *zərf* 1. Dəli kimi, dəlicəsinə. *Fırlatdı bir qəhqəhə; Çılğınca qalxdı birdən.* Ə.Cavad. *Gülgəz çılğıncasına atasının yaxasını didişdirməyə başladı.* İ.Hüseynov.

2. *məc.* Ehtirasla, dəlicəsinə. *Çılğıncasına sevmək. Çılğıncasına vurulmaq.*

**ÇILĞINLAŞMA** "Çılğınlaşmaq"dan *f.sif.*

**ÇILĞINLAŞMAQ** *f.* Azğınlaşmaq, coşmaq, dəli kimi hərəkət etmək. // *məc.* Coşmaq, qudurmaq, azğınlaşmaq. *Dəniz getdikcə çılğınlaşırdı.*

**ÇILĞINLIQ** *is.* Çılğın adamın hal və keyfiyyəti; dəlicəsinə, azğıncasına hərəkət. *Çılğınlıq etmək.*

**ÇILPAQ** *sif.* 1. Əynində heç bir paltar olmayan, bədəni heç bir şeylə örtülməmiş; paltar geyməmiş; soyunmuş, lüt-üryan. *Çılpaq uşaq. Çılpaq bədən. – Bu qızlar təqribən tamamilə çılpaq idi(lər), onların önə tutduqları bir parça bezdən başqa heç bir libasları yox idi.* M.S.Ordubadi. // Açıq olan, geyimlə örtülməmiş. *Zəhərli bir ilan atılıb, Zəhra xalanın çılpaq qolundan sancdı.* S.S.Axundov. *Fəhlələrin kəmər yerinə qədər çılpaq, tərli bədənləri mis rənginə çalırdı.* M.Hüseyn. // *Zərf mənasında.* Əynində heç bir şey olmadığı halda; lüt, paltarsız. *Çılpaq yatmaq. Çılpaq olmaq.*

2. Yəhərsiz, palansız, çulsuz. *Səməndər çılpaq atın belinə atıldı, alt tərəfdən sürdü, Nərgizə yanaşdı.* B.Bayramov.

3. *məc.* Bitkisiz. *Çılpaq səhra.* – [Gülüş Atakişiyə:] *Sən çılpaq çölə düşəcək, dəhşətli maşınlar içində qalacaqsan.* C.Cabbarlı. *Bir-birinə söykənib yastı, çılpaq təpələr; Ətəyi kollu-koslu, zirvəsi ağ təpələr.* B.Vahabzadə.

4. Yarpağı olmayan, yarpağı tökülmüş; yarpaqsız. *Çılpaq kol. – Hava yavaş-yavaş işıqlanırdı, torağaylar uçuşub yeni-yeni puçurlanan ağacların çılpaq budaqlarına qonurdu.* M.Hüseyn. *Yonca baxdı palıda; Gördü çılpaqdır tamam.* B.Vahabzadə.

5. *məc.* Yoxsul, paltarsız, üst-başı tökülmüş. *Zeynəb qaldı ac, çılpaq və sahibsiz.* C.Məmmədquluzadə. [Səlimi İsfahaniyə:] *Bəs sizin insafınız necə qəbul edir ki, İranın xırda-boyük bütün şəhərlərində gündən-günə işsizlərin, ac və çılpaqların* (is.) *sayı artır?!* M.İbrahimov.

6. *məc.* Əlavəsiz, artırmasız, necə var elə. *Qaçay müqəddiməsiz başladı və bir növ sualları çılpaq* (z.) *verdi.* Ə.Vəliyev. *Ər isə .. gözləyirdi ki, arvadı fikrini çılpaq və qəti surətdə ortaya atsın.* Ə.Məmmədxanlı.

**ÇILPAQCA** 1. *sif.* və *zərf* Çılpaq, lüt-üryan. *Çılpaqca uşaq. Çılpaqca oturmaq.*

2. *is. zool.* Ağzının künclərində və başında bığı olan girdəbaşlı balıq növü.

**ÇILPAQLANMA** "Çılpaqlanmaq"dan *f.sif.*

**ÇILPAQLANMAQ** *f.* 1. Paltarlarını soyunmaq, çılpaq olmaq, lüt olmaq, üryan olmaq. *Lakin Mehriban Zakirin yanında çılpaqlanıb suya girə bilərdimi?* H.Seyidbəyli.

2. B a x **çılpaqlaşmaq** 2-ci mənada. *Ağaclar lütlənir, meşələr çılpaqlanırdı.* S.Rəhimov.

**ÇILPAQLAŞMA** "Çılpaqlaşmaq"dan *f.sif.*

**ÇILPAQLAŞMAQ** *f.* 1. B a x **çılpaqlanmaq** 1-ci mənada. [Tahir] *sonra tamam çılpaqlaşıb, özünü duşun altına verdi.* M.Hüseyn.

2. *məc.* Yarpaqlarını tökmək, bitkisi məhv olmaq; dazlaşmaq. *Kollar çılpaqlaşıb. – Təpələrin üstünü və tamamilə çılpaqlaşmış* (f.sif.) *ağacların budaqlarını quşbaşı qar örtmüşdü.* M.İbrahimov.

**ÇILPAQLIQ** *is.* 1. Çılpaq vəziyyət; lütlük, üryanlıq.

2. *məc.* Otu, bitkisi qurumuş, məhv olmuş yerin halı. *Çölün çılpaqlığı.*

3. *məc.* Yarpağı tökülmüş ağacın, bitkinin halı; yarpaqsızlıq. *Ağacın çılpaqlığı.*

**ÇIMXIRMA** "Çımxırmaq"dan *f.is.*

**ÇIMXIRMAQ** *f.* Məzəmmətlə qışqırmaq, töhmətləndirmək. [Baloğlan:] [Almaz] *əvvəl bir çımxırdı üstümə, mən də bir təpindim ona.* C.Cabbarlı. *Əlyarov .. şoferinin üzünə baxmadan çımxırdı.* M.Hüseyn.

**ÇINQIL** *is.* Tikinti işlərində istifadə olunan daş qırıntısı, xırda daş. *Çəpərlər aradan bir-bir sökülsün; Palçıqlı yollara çınqıl tökülsün.* S.Vurğun. *Sən gəzdiyin torpağın çınqılı, çəlik daşı; Sanıram ki, misilsiz bir incidir, gövhərdir.* M.Rahim. // Çınqılla örtülmüş, çınqıl döşənmiş; çınqıllı. *Çınqıl yol.*

**ÇINQILLI** *sif.* Çınqıl olan, çınqıldan ibarət olan. *Uzaqdan çınqıllı dağdan götürülən böyük arx kəndin günçıxan qoluna qədər gətirilir və böyük bir daşın yarığından üzüaşağı buraxılırdı.* S.Rəhimov. *Onu yaşadacaq hər dərə, hər dağ; Çınqıllı daşlardan süzülən bulaq.* N.Xəzri.

**ÇINQILLIQ** *is.* Çoxlu çınqıl olan yer, çınqıl çıxarılan yer. *Çınqıllıqdan çınqıl çıxarmaq. – Çınqıllıq yuxarı qanadlanan Bozat çoxdan Sarıbaba dağının gədəyini aşmışdı.* S.Rəhimov. *Bura çınqıllıq bir güney idi.* Mir Cəlal.

**ÇINQILOTU** *is. bot.* Meşələrdə, dağ-çəmənlərdə və çox rütubətli çınqıllı yerlərdə bitən çoxillik ot bitkisi.

**ÇINQIR** *is. dan.* Səs, səs-səmir, çınqırtı. ☐ **Çınqırını çəkməmək** – səs çıxarmamaq, ağzını açmamaq.

**ÇINQIRIQ** *is.* Zəng. *Birdən-birə qapının çınqırığı vuruldu.* A.Şaiq. *Anaxanım Novruz qızı küçələri sürətlə keçib, evinə yetişdi, yuxarı qalxıb, əlini hirslə çınqırıq düyməsinə basdı.* S.Rəhimov.

**ÇINQIRTI** b a x **çınqırıq**.

**ÇINLAMA** "Çınlamaq"dan *f.is.*

**ÇINLAMAQ** *f.* Səslənmək, eşidilmək, səsi gəlmək. *Qoy çınlasın varlığın; Ömrün, bəxtiyarlığın; Şadlıq kamançası da.* M.Müşfiq. *Haradasa musiqi çınlayır, ətrafa coşqun rəqs havası yayılır.* Ə.Məmmədxanlı.

**ÇINLATMA** "Çınlatmaq"dan *f.is.*

**ÇINLATMAQ** *f.* Səsləndirmək. *Söyləyiniz dastanını; Çınlatınız kamanını; Gözəlliyin, daşqın sular!* M.Müşfiq.

**ÇIRA** b a x **çıraq**. *Bir kiçicik daxmada ancaq çıra; Saçmada ətrafına ölgün ziya.* A.Şaiq.

**ÇIRAQ** *is.* [*fars.*] Hər cür işıqlandırıcı cihaz (qaraçıraq, lampa, fənər, lampoçka və s.). [Molla:] *Ay filankəs, gecənin bu vaxtında əlində çıraq orada nə gəzirsən?* "M.N.lətif.". [Yaşlı kişi:] *Elektrik çıraqlarının keçirilməsi məni özümə gətirdi.* S.Hüseyn. *Küncdə yerə qoyulmuş çırağın piltəsi aşağı düşdüyündən sönük, sarı işığı alaçığı işıqlandıra bilmirdi.* M.İbrahimov. // *məc.* İşıq, ziya, nur mənasında. *Tutdu Yer üzünü ürfan çırağı; Nura qərq elədi qonşu torpağı.* M.Rahim. *Onun ümid çırağıyla; Arayırdıq yolumuzu.* R.Rza.

◊ **Çırağı sönmək** *məc.* – sonu çatmaq, məhv olmaq. *Aradan keçdi illər; Çarın söndü çırağı.* Ə.Cavad. *Faşizmin çırağı sönərkən bir gün; Qol-boyun olaraq öpüşərik biz.* S.Rüstəm. **Çırağını yandıran** – işini, nəslini davam etdirən. [Ziyad xan:] *Öləndən sonra bizim çırağımızı yandıran olmayacaq.* "Əsli və Kərəm". **Çıraq yanan vaxt** – hava qaralan vaxt, axşamüstü. [Şəhrəbanu xanım:] *Xülasə, axşam çıraq yanan vaxtda Məstəli şah gərək bizim evdə hazır olsun.* M.F.Axundzadə. **Çıraq sönən vaxt** – yatmaq vaxtı, adamlar yatan vaxt. **Çıraqla axtarsan, tapa bilməzsən** – çox çətin tapılan, az ələ düşən şey haqqında. [Rüstəm bəy:] [Məşədi İbadın] *hərçənd bir az yaşı çoxdur, amma bir yaxşı adamdır ki, beləsini çıraqla axtarsan, tapa bilməzsən.* Ü.Hacıbəyov.

**ÇIRAQBAN** *is.* [*fars.*] Çıraqbanlıq, çıraqlarla işıqlandırılmış. *Çıraqbandır tamam yer, göy; Nə zəncir var, nə bir zindan.* S.Vurğun. *Klubun içərisi çıraqban idi.* S.Rəhman. ☐ **Çıraqban etmək** – işıqlandırmaq, nurlandırmaq. *Camalın şöləsi nuri-təcəlla; Çıraqban eyləyib mahalı, Xurşud!* Aşıq Ələsgər. **Çıraqban olmaq** – işıqlanmaq, nurlanmaq. *Bayram gecələri Bərdə şəhəri sübhə kimi çıraqban olub.* F.Köçərli.

**ÇIRAQBANLIQ** *is.* 1. Çıraqban olma, çoxlu işıq yanma, çıraqların yanması nəticəsində hasil olan işıq. *Bu gecə Naxçıvanda*

*indiyə qədər misli görünməmiş bir çıraqbanlıq var idi.* M.S.Ordubadi.

2. Hər hansı bir bayram, təntənəli şadyanalıq münasibətilə binaların, küçələrin işıqlarla bəzədilməsi. *Parkda çıraqbanlıq təşkil etmək.*

**ÇIR-ÇIR: çır-çır çığırmaq** – bərk çığırmaq, qışqırmaq, bağırmaq. *Sabah yola düşəndə də* [uşaq] *çır-çır çığırırdı.* "Aşıq Ələsgər". [Şahbaz bəy:] *Şərəfnisə, qadan alım, bilirsən ki, əmidostum bu gün nə tufan elədi? Müsyö Jordanın yanında əmimin üstünə çır-çır çığırdı, məni də hədələdi.* M.F.Axundzadə.

**ÇIRMALAMA** "Çırmalamaq"dan *f.is.*

**ÇIRMALAMAQ** b a x **çırmamaq**. [Mübaşir Məmməd Musa kişiyə:] *Qollarını niyə çırmalamısan, kişi? Yoxsa pəhləvanlıq eləmək fikrindəsən?* M.İbrahimov. *Çırmala qolunu düşərək meydana.* M.Müşfiq.

**ÇIRMALANMA** "Çırmalanmaq"dan *f.is.*

**ÇIRMALANMAQ** "Çırmalamaq"dan *məch.;* çırmanmaq.

**ÇIRMALI** *sif.* Paltarının qolu (qolları) və ya şalvarın balağı (balaqları) bir neçə qat qatlanılıb yuxarı qaldırılmış; çırmalanmış, çırmanmış. *Həmzə bəy xəyalatda ikən salona qolları çırmalı iki soldat girdi.* Çəmənzəminli.

**ÇIRMAMA** "Çırmamaq"dan *f.is.*

**ÇIRMAMAQ** *f.* Paltarının qolunu və ya şalvarının balağını bir neçə qat qatlayıb qaldırmaq, çırmalamaq; çırmanmaq. [Gülsənəm] *Tahirdən cavab almamış, qollarını çırmadı, un gətirib, xəmir yoğurmağa başladı.* M.Hüseyn. *Musa kişi qolunu çırmadı, bıçağı daşa çəkdi.* M.İbrahimov.

◊ **Qolunu çırmamaq** *məc.* – bir işi görmək üçün hazırlıq görmək, hazırlaşmaq, hazır olub gözləmək. *Çırma qollarını, öt ustadını; Lakin əsərinlə, quru sözlə yox.* S.Rüstəm.

**ÇIRMANMA** "Çırmanmaq"dan *f.is.*

**ÇIRMANMAQ** *qayıd.* Paltarının qolunu və ya şalvarının balağını çırmamaq. *Çırmanırıq keçməyə çay gəlməmiş; Başlayırıq qızmağa yay gəlməmiş.* M.Ə.Sabir.

**ÇIRPI** *top.* Quru budaq, kol qırıntısı; çılçırpı. *On altı-on yeddi yaşlarında bir qız çayaşağı enərək, meşənin ətəklərində çırpı yığırdı.* Çəmənzəminli. *Şərifzadə ehtiyatla yeriyir, ayaqları altında əzilən quru çırpıların qəribə səsini dinləyə-dinləyə gedirdi.* M.Hüseyn.

**ÇIRPILMA** "Çırpılmaq"dan *f.is.*

**ÇIRPILMAQ** *məch.* 1. Bir şeylə vurularaq tozu çıxarılmaq (yorğan-döşək, geyim, xalça-palaz və s. haqqında). *İsti paltarların boğçadan çıxarılıb həyətlərdə, eyvanlarda çırpıldığını, şəritə atıldığını görmək olurdu.* Mir Cəlal. *Döşəklərin yunu çırpılır, didilir və təzədən salınır.* Ə.Abasov.

2. Bərk səslə örtülmək. *Birdən qapı çırpıldı bərk; Qız diksindi bu zaman.* Ə.Cəmil. *Hümmət cavab verincəyə qədər qapı çırpıldı.* B.Bayramov.

3. Şappıltı ilə yerə dəymək: yıxılmaq. *Gülüş* [Məmişi] *otağın içində hərlədi, hıçqıra-hıçqıra qovladı, birdən sürüşüb üzüüstə döşəməyə çırpıldı.* S.Rəhimov.

**ÇIRPINIŞ** *is.* 1. Çırpınma işi, çırpınma. *Nədir o istəkli, o heyran baxış? Nə dadlı cik-cik, nə gözəl çırpınış!* A.Səhhət.

2. *məc.* Çalışıb-çapalama. [Kərimxana] *elə gəlirdi ki, bəşər tarixində qəhrəmanları yetirən ancaq bir məqsədə olan meyil, .. bir arzuya doğru çırpınışdır!* M.İbrahimov.

**ÇIRPINMA** "Çırpınmaq"dan *f.sif.*

**ÇIRPINMAQ** *f.* 1. Bərk döyünmək, oynamaq, titrəmək, vurmaq. *Ürəyi* (qəlbi) *çırpınmaq. – Könül bir quşdur ki, sevməz əsarət: Daim çırpınır, istəyir hürriyyət.* A.Səhhət. [Jasmen:] *Seyr etdim o heçlikləri mən də; Çırpındı könül matəm içində.* H.Cavid.

2. Özünü xilas etmək üçün qanadlarını oynadaraq təlaş içində çalışmaq (quşlar haqqında). *Qızılquş pəncəsindən qurtulub özünü insan əlində əsir görən kəklik qurtulmaq üçün həyəcanla çırpınır, əllərimizi dimdikləyirdi.* A.Şaiq. *Eldar hələ ölməmiş və çırpınmaqda olan xoruzu götürüb, mənə uzatdı.* M.Rzaquluzadə.

3. Zərbə ilə örtülmək, bağlanmaq. *Qapı çırpıldı.*

4. Səs çıxardaraq toxunmaq, xəfifcə çarpmaq. *Neva çırpınır yatağında: Sudan çıxmış balıq kimi.* R.Rza. *Bakıdan beş gün ayrılanda; Yuxuma Xəzər girir; Sarı qumlu*

*sahillərdə çırpınan; Gümüş telli ləpələr girir.* N.Rəfibəyli.

5. Üstündəki tozu, torpağı, su damlalarını düşürtmək üçün bədəni şiddətlə sarsıtmaq; silkələnmək. *Qoyun çimdiriləndən sonra çırpındı. – Sərin sabah küləyi boşluğa yayılırdı; Quşlar yuvalarında çırpınıb ayılırdı.* R.Rza.

**ÇIRPINTI** *is.* Döyünmə, döyüntü, çırpınma. *..Çırpıntılar içərisində çapaladığım halda, Mahrunu gözləməkdə idim.* M.S.Ordubadi. *..Birdən Səmədin qəlbinin riqqətli döyüntüsü narahat bir çırpıntıya çevrildi.* İ.Hüseynov.

**ÇIRPIŞDIRMA** "Çırpışdırmaq"dan *f.sif.*

**ÇIRPIŞDIRMAQ** *f.* Gizlicə götürmək; oğurlamaq, çalmaq. *Qurban demir ki, gərək kartoşkaya qarovul çəkək? Demir ki, kulaklar kartoşkanı çırpışdırırlar?* Mir Cəlal.

**ÇIRPMA** "Çırpmaq"dan *f.sif.*

**ÇIRPMAQ** *f.* 1. Tozunu almaq və ya başqa məqsədlə ağac və ya əllə vurmaq, döyəcləmək, silkələmək. *Yun çırpmaq. Xalçanı çırpmaq. – Dəllək fitəni götürüb artırmada çırpmağa başladı, yenə bir-iki məsəl çəkmək istədi.* Çəmənzəminli. *Gəldiyev qapıda üst-başını çırpır, papağını düzəldirdi.* Mir Cəlal.

2. Şiddətlə vurmaq, çarpmaq, yıxmaq. *Pası əl-ayağını uzadır və özünü yerə çırpırdı.* S.Rəhimov. *Bəy zıqqana-zıqqana ağır gövdəsini yerdən üzdü, dərhal yenə döşəkcəyə çırpdı.* Mir Cəlal. // Hirslə atmaq, tullamaq, çarpmaq, vurmaq. *İskəndər itdən əl çəkib, çox həvəsli və kefli, şlyapasını krovatın üstünə çırpıb başlayır papiros eşməyə.* C.Məmmədquluzadə. [Ruqiyyə xanım] *əlini qaldırdığı qədəhlə bərabər masanın üzərinə çırpdı.* S.Hüseyn.

3. Çarpdırmaq, vurmaq. *Xəzri yeli axşamdan hirslə qalxıb, Bakı küçələrinin toz-torpağını daşa-divara çırpırdı.* S.Qənizadə. *Axırda sel* [Qaraca qızla Yasəməni] *bir böyük daşa çırpdı.* S.S.Axundov. // Şiddətlə vurmaq, ilişdirmək, zərbə endirmək. *Lal Hüseyn şallağı qapdı,* [Rüstəm kişinin] *başına-başına çırpdı.* M.İbrahimov. *Çoban* [düşmənə] *qalxmağa fürsət verməyib çomağı başına çırpdı və özü bağıryaran bir səslə qıy vurub irəli şığıdı.* M.Rzaquluzadə.

4. Tez-tez vurmaq, döyünmək ("qəlbi", "ürəyi" sözləri ilə). [Araz] *Vanyuşanı görüncə başı dumanlandı, qəlbi şiddətlə çırpmağa başladı.* A.Şaiq. *Bu zaman bizim qəlbimiz daha həyəcanla çırpır.* M.İbrahimov.

5. Tut, qaysı və bəzi başqa meyvələri ağacın budaqlarını bir şeylə vurmaq və ya əllə tərpətməklə yerə tökmək. [Xanqulu] *ağasının həyatində kələm əkir, göyərti becərir, tut ağaclarını çırpır, tutundan sirkə qayırırdı.* Çəmənzəminli.

6. B a x **çırpışdırmaq**. [Xortdan:] *Görəsən, varislərindən nə qədər çırpıbdır.* Ə.Haqverdiyev.

7. Bişirmək üçün yumurtanı sındırıb içindəkini qaba tökmək. *Küküyə üç dənə yumurta çırpmaq.*

**ÇIRT** *təql.* Tüpürərkən çıxan səs. □ **Çırt atmaq** – tüpürmək, tüpürərkən çırt səsi çıxartmaq. [Qənbərqulu:] [Əsgər] *uzun bir çubuq da qoyub damağına, sağa da çırt atır, sola da.* B.Talıblı. [Bəy] *yandan düşmüş dişinin yerindən çırt atdı və danışdı.* Mir Cəlal. **Çırt çubuğu** – tənbəki çəkmək üçün uzun çubuq, qəlyan. *Rəhim bəy bunu deyərək bir dənə uzunquyruq çırt çubuğunu çıxardıb qabağına qoydu.* Ə.Haqverdiyev. [Aftil:] *Kəblə Fatmanisənin də çırt çubuğu elə fısıldayır ki, elə bil paroxod bacasıdır.* C.Cabbarlı. **Çırt tənbəkisi** – çırt çubuğuna doldurmaq üçün tənbəki. [Əmrah:] *Necə ola bilər ki, çırt tənbəkisi çəkə, ağzından xanıma pis iy gəlməyə?!* Ə.Haqverdiyev.

**ÇIRTAÇIRT** *zərf* Çırtıldayaraq, çırt səsi çıxararaq; bərk alışaraq. *Nəhayət, tonqal alovlanıb çırtaçırt yandı.* B.Bayramov.

**ÇIRTDAQ** *is.* Quru odun, çırpı və s. yanarkən çırt-çırt səslə qalxan qığılcım. *Közərən kösövlərdən qopan çırtdaqlar yuxarıya, bacaya doğru sıçradı.* Ə.Məmmədxanlı.

**ÇIRTIQ** *is.* 1. Bir və iki əlin bir neçə barmağını (adətən orta barmaqları baş barmağa) zərblə bir-birinə vurub çırt səsi çıxarma; çırtmıq. *Birdən çırtıq və oxumaq səsləri eşidildi.* İ.Əfəndiyev. □ **Çırtıq vurmaq (çalmaq)** – bir və ya iki əlin barmaqlarını bir-birinə (adətən orta barmağı baş barmağa) vurmaqla səs çıxarmaq. *Mərcan bəy acıqlı-acıqlı çırtıq vurur.* Ü.Hacıbəyov. [Şahmar:]

*Oğlan oturduğu yerdə çırtıq çalmağa başladı.* B.Bayramov.

2. Bax **çırtma[1]** 2-ci mənada. □ **Çırtıq vurmaq** – bax **çırtma vurmaq** 2-ci mənada (**“çırtma[1]”**da).

◊ **Çırtıq vursan qanı tökülər (çıxar)** – bax **çırtma vursan qanı tökülər (çıxar)** (**“çırtma[1]”**da). *Pullu Məhərrəmin qızı Cavahirin də ki, çırtıq vursan qanı tökülər.* “Aşıq Ələsgər”.

**ÇIRTILDAMA** “Çırtıldamaq”dan *f.sif.*

**ÇIRTILDAMAQ** *f.* Çırt-çırt səs çıxarmaq, çırt eləmək. *Yanan yüzlərlə elektrik lampalarının süd kimi işıqlandırdığı yerdə qaynaq şamlarının gözqamaşdırıcı qığılcımları çırtıldayır.* M.Əlizadə.

**ÇIRTILTI** *is.* Quru odun və s. yanarkən və ya quru otu tapdalayarkən çıxan səs, çırt-çırt səsi. *Ocaq qalanmış, quru ağac budaqlarının çırtıltı ilə yanmasından əmələ gələn alov ocağın ətrafını qızdırırdı.* T.Ş.Simurq. *Qapıya yaxın qoyulmuş peçdəki çəkil odunlar çırtıltı ilə yanıb səs etsə də, Nərgiz Həsənli telefonla rayona məlumat versə də danışanlara mane olmurdu.* Ə.Vəliyev.

**ÇIRTI-PIRTI** *sif. dan.* Boş, mənasız, cəfəng. *Çırtı-pırtı söhbət.*

**ÇIRTLAQ** *is.* Yanan və ya közərən ocaqdan çıxan parıltılı kiçik hissəciklər; qığılcım.

**ÇIRTLAMA** “Çırtlamaq”dan *f.sif.*

**ÇIRTLAMAQ** *f.* 1. Qabığı, bərk şeyi dişlə bərk basaraq parçalamaq; xırdalamaq; sındırmaq. *Tum çırtlamaq.*

2. Gül açmağa başlamaq, açılmağa, cücərməyə başlamaq. [Yazgül:] *Bizim yerdə bir yazda – gül çırtlayanda, bir də payızda – qoz çatlayanda bərk külək əsir.* Ə.Məmmədxanlı. *Güllərin üstü qoza ilə doludur, bəzi qozalar artıq çırtlayıb yarılır.* (Qəzetlərdən). // Göyərməyə, bitməyə başlamaq. *Toxum çırtladı.*

3. *məc.* Yenicə doğmaq, çıxmaq (Günəş haqqında). *Şərq üfüqlərində günəş yenicə çırtlamağa başlayırdı.* M.İbrahimov. [Səttar:] *Əşi, yuxudan oyanıb gözümüzü açıram, görürəm, gün təzəcə çırtlayır.* Ə.Əbülhəsən.

**ÇIRTMA[1]** 1. Bax **çırtıq** 1-ci mənada.

2. Barmaqlardan birinin (adətən orta barmağın) ucunu baş barmağa dayayaraq zərblə vurma; çırtıq, çırtmıq. □ **Çırtma vurmaq** – barmaqlardan birinin (adətən orta barmağın) ucunu baş barmağa dayayaraq zərblə vurmaq; çırtıq vurmaq.

◊ **Çırtma vursan qanı tökülər (çıxar)** – çox sağlam, üzü çəhrayı, gümrah adam haqqında. *Toyuna hazırlaşan gəlinə isə çırtma vursan qanı tökülər.* B.Bayramov.

**ÇIRTMA[2]** “Çırtmaq”dan *f.sif.*

**ÇIRTMAQ** bax **çırtlamaq** 3-cü mənada. *Araba şəhərdən çıxarkən günəş yenicə çırtır, şərqi bürüyən qırmızılıqdan üfüqlərdəki dağ silsiləsi kimi görünən buludlar əlvan rənglərə boyanırdı.* A.Şaiq.

**ÇIRTMALAMA** “Çırtmalamaq”dan *f.sif.*

**ÇIRTMALAMAQ** *f.* Barmaqla çırtma vurub yoxlamaq. *İkisi də küçəni o taya keçib, qarpızsatan bir gənc qıza tərəf yönəldi. Cəfər qarpızları bir-bir çırtmaladı.* Çəmənzəminli.

**ÇIRTMIQ** 1. Bax **çırtıq** 1-ci mənada.

2. Bax **çırtma[1]** 2-ci mənada.

**ÇİBAN** *is. tib.* Dərinin tük kisəciyinin və piy vəzisinin irinli iltihabı.

**ÇİBİN** *is.* Milçək. *Quş dənə yığılar, çibin şirəyə.* (Ata. sözü).

**ÇİÇƏ** *sif.* Saf, təmiz, qəşəng (uşaq dilində).

**ÇİÇƏK[1]** *is.* 1. *bot.* Çılpaqtoxumlu və örtülütoxumlu bitkilərin ləçək tacından və erkəkciklə dişicikdən ibarət çoxalma orqanı. *Alma ağacı çiçəyi. Yasəmən çiçəyi. Sarı çiçək.* – [Dilbərgilin] *həyətlərindəki yasəmən, ərik, alça, albalı ağaclarının çiçəkləri ətrafa məstedici bir qoxu saçırdı.* Ə.Sadıq.

2. Çiçəkləri olan bitki; gül. *Gözəllər çiçək dərib, tər buxağa düzərlər..* Q.Zakir. *Yer üzündə sevdiyim; Çiçəklərdi, çiçəklər.* N.Xəzri.

◊ **Çiçəyi çırtlamaq** – sevinmək, şadlanmaq, sevincək olmaq. *Gördüm ki, qızın çiçəyi çırtladı.* S.Rəhimov. *Bayaqdan bəri qəm dəryasında boğulan Salehin indi elə bil çiçəyi çırtlayırdı.* Ə.Vəliyev. **Gül gülü çağırır, çiçək çiçəyi** – bax **gül**.

**ÇİÇƏK[2]** *is. tib.* Dəridə və selikli qişalarda qabarcıqlı səpgi və titrətmə-qızdırma şəklində təzahür edən ağır keçici xəstəlik. [Gülbadamın] *uşaqlıqda çiçək mərəzinə mübtəla olmağı üzündən məlum edirdi!* N.Nərimanov. *Şaban gedəndən iki il sonra*

*beş yaşında oğlu çiçəkdən öldü.* Ə.Haqverdiyev. // *dan*. Həmin xəstəlikdən sonra dəridə və ya qoruyucu peyvəndin yerində qalan çatıqlar, batıqlar; çopur. ☐ **Çiçək çıxartmaq** – çiçək xəstəliyinə tutulmaq. **Çiçək (çiçəyini) döydürmək** – çiçək xəstəliyinə qarşı peyvənd etdirmək. *Dedim: – Oğlanə çiçək döydürək, övrət dedi: – Yox; Etiqad eyləmədim mən də o dərmanə, çiçək!* M.Möcüz.

**ÇİÇƏKAÇMA** *is. bot*. Çiçəklənmə. *Ağacların çiçəkaçma dövrü.*

**ÇİÇƏKAYAQCIĞI** *is. bot.* Budağın çiçək olan hissəsi.

**ÇİÇƏKÇİ** *is*. Çiçək yetişdirməklə məşğul olan adam, çiçəkçilik mütəxəssisi; gülçü.

**ÇİÇƏKÇİLİK** *is*. Bağçılığın bir sahəsi kimi çiçək, bəzək bitkiləri becərib yetişdirmə işi. *Heç şübhə yoxdur ki, ildən-ilə genişlənən elmi tədqiqat işləri bir çox bəzək bitkilərini müəyyənləşdirib, bəzək çiçəkçiliyinə daxil edəcəkdir.* "Elm və həyat".

**ÇİÇƏKDAN** b a x **güldan**.

**ÇİÇƏKDÖYMƏ** *is*. Çiçəyə qarşı peyvənd etmə (b a x **çiçək²**).

**ÇİÇƏKKORLUĞU** b a x **daltonizm**.

**ÇİÇƏKLƏMƏ** "Çiçəkləmək"dən *f.is*.

**ÇİÇƏKLƏMƏK** *f*. Çiçək açmaq, çiçəklənmək. *Ağaclar çiçəkləmişdi. Meşələr bahar səslərilə dolu idi.* İ.Əfəndiyev.

**ÇİÇƏKLƏNDİRMƏ** "Çiçəkləndirmək"-dən *f.is*.

**ÇİÇƏKLƏNDİRMƏK** *f*. 1. Bir yerdə çiçək əkib becərmək. *Bağçanı çiçəkləndirmək*. // Bir yeri çiçəklərlə bəzəmək.

2. *məc*. İnkişaf etdirmək, tərəqqi etdirmək. *Mədəniyyəti çiçəkləndirmək.*

**ÇİÇƏKLƏNMƏ** "Çiçəklənmək"dən *f.is*.

**ÇİÇƏKLƏNMƏK** *f*. 1. Çiçək açmaq, gül açmaq, çiçəkləmək. *Çiçəklənib bar verir sulananda bağ-bağat; Su ilə boz səhrada canlanıb qalxır həyat.* N.Rəfibəyli. *Bahar çağı Qubada; Çiçəklənir ağaclar.* M.Seyidzadə.

2. *məc*. İnkişaf etmək, tərəqqi etmək, çiçəkləmək. // *məc*. Abadlaşmaq, abad olmaq. *İnsanın tükənməz əbədiyyəti; Çiçəklənir onun sinirlərində.* M.Müşfiq. *Zəhmətinlə çiçəklənir; Qara qumlu səhralar.* Aşıq Hüseyn.

3. *məc*. Həyata keçmək, yerinə yetmək. *Bir gün olacaq, ürəkdə qalan arzular çiçəklənəcək.* S.Vəliyev.

**ÇİÇƏKLİ** *sif*. Çiçək açmış, gül açmış: çiçəklənmiş. *Bir yanda kəkliklər, ayna bulaqlar; Bir yanda bülbüllər, çiçəkli bağlar.* M.Müşfiq. *Gəzdim ovçu kimi hər oylağında; Çəmənli, çiçəkli göy yaylağında.* Aşıq Şəmşir. // Çiçəkləri olan. *Çiçəkli ağac. – Gənc qızlar yüyürüşüb, oğlanın başına .. rəngarəng çiçəkli budaqlardan hörülmüş çələnglər qoydular.* M.Rzaquluzadə.

**ÇİÇƏKLİK** *is*. Çiçək əkilmiş yer, çoxlu çiçək bitən lək, bağça. *Xanın evinin qabağı çiçəklik və böyük bağçalıqdı.* M.S.Ordubadi. *Ellər şərəfinə qurulmuş toy-düyün; Dörd yanın bağçadır – güllük, çiçəklik.* N.Rəfibəyli.

**ÇİÇƏKPƏRƏST** b a x **gülpərəst**.

**ÇİÇƏKSEVƏN** 1. B a x **çiçəkpərəst**.

2. *is. zool*. Ağacın çürümüş yerlərində yaşayan cücü.

**ÇİÇƏKYATAĞI** *is. bot.* Çiçəkayaqcığının yuxarı, enli hissəsi.

**ÇİÇƏKYEYƏN** *is*. Bitkilərin çiçək və qönçələri ilə qidalanan bəzi böcəklərin adı.

**ÇİFAYDA** *ara s*. [*fars*.] Nə olsun ki, nə xeyri var, təəssüf ki. *Sərraf əlində olsan əgər yoxdu qiymətin; Bir ləlsən, çifaidə, yox qədrini bilən.* S.Ə.Şirvani. *Mərvdən gələn kağızda yazılıb ki, "camaat artıq meyil edirlər, abunə olub məcmuə oxusunlar", amma, çifayda, bimövqe mətləblər, mane olur!* C.Məmmədquluzadə.

**ÇİL¹** *is*. 1. Dəridə, əksərən üzdə əmələ gələn qəhvəyi və ya sarımtıl rəngli xırda ləkələr, çillər; ləkə, xal. [Direktorun] *üzündə çopura oxşayan çil vardı.* Mir Cəlal. *Kəramətin çil, dolu çöhrəsi kimi dolğun da səsi vardı.* Ə.Əbülhəsən.

2. *Sif. mənasında*. Müəyyən rəngdə olan heyvanların, əksərən quşların tükləri içində başqa rəngdə xırda ləkələr, xallar. *Çil xoruz. – Bir qış axşamıydı, qapıda soyuq; Qalxdı tar üstünə bizim çil toyuq.* S.Vurğun. *Çil bildirçinlər .. hərəni öz dilində qarşılayırdılar..* M.Rzaquluzadə.

3. Parça üzərində, əksərən dairəvi şəkildə olan başqa rəngli xırda xallar. *Parçanın çilləri*.

**ÇİL**[2] *is. zool.* Tetraquşular ailəsindən ala-bəzək kiçik meşə quşu.

**ÇİL**[3] *is. bot.* Kökümsovlu çoxillik ot bitkisi.

**ÇİL-ÇİL** *sif.* Çoxlu çili olan, çil basmış, çil. *Çil-çil xoruz. Çil-çil toyuq. – Cücələrim bəzəklidir; Bəzəklidir, düzəklidir; Sarı, çil-çil hər rənglidir.* A.Səhhət. [Səmədin] *sevindiyindən üst dodağı ikiqat açılıb, burnunun dibinə çəkilər, ağzından sarı dişləri görünər, sarı, çil-çil üzü gülər*(*di*). B.Talıblı.

**ÇİLÇIRAQ** *is.* Bir neçə lampadan (keçmişdə şamdan) ibarət asma tavan çırağı, qəndil, lüstr, avizə. *Tükəzban qarı çayı-çörəyi gətirib üzərindən göyörtüklü çilçıraq sallanan böyük yemək masasına qoyanda Lalə də özünü səliqəyə salıb gəldi.* M.Hüseyn. [Qaçay:] *Çünki* [Mahmud] *belə vaxtlarda lampanı yox, tavandan asılmış iri çilçırağı yandırır.* Z.Xəlil.

**ÇİLÇIRAQBAN** b a x **çilçıraqlı** 2-ci mənada. *Çilçıraqban küçə.*

**ÇİLÇIRAQLI** *sif.* 1. Çilçırağı olan. *Geniş otaqda çilçıraqlı lampa yanırdı.* S.Rəhimov.

2. İşıqlı, çıraqban. *Təkcə çilçıraqlı Bakıya, onun ağuşunda qatarlanmış möhtəşəm binalara bir daha nəzər salmaq kifayətdir.* (Qəzetlərdən).

**ÇİLƏ** *is.* 1. Kotanın bıçaq, qoşqu qarmağı və s. bərkidilən uzun tirdən ibarət hissəsi. *Yoxlama zamanı kultivatorun çiləsi .. və çərçivəsi üfüqi vəziyyətdə olmalıdır.* (Qəzetlərdən).

2. Böyük dərd, əzab. *Mən qürbətdə ölərsəm qəlbinə salma çilə; Söylə, dostlar gömməsin nəşimi torpaqlara.* A.İldırım.

**ÇİLƏGƏN** *is.* Suvağı saxlamaq üçün onun altına vurulan nazik, ensiz taxta.

**ÇİLƏMƏ** "Çiləmək"dən *f.sif.*

**ÇİLƏMƏK** *f.* 1. Sıçrantı halında, damcı-damcı tökmək, səpmək, sıçratmaq. *Başına odekolon çiləmək. – Əsgərin gözü Kosanın qayırmış olduğu çalaya sataşdı. Kosa sısqa arx ilə su gətirər, bu çalaya doldurar, buradan da bostanına çilər və ləzzət alardı.* S.Rəhimov. [Qız] *hisli lampanın neftini bədəninə çiləyib özünü yandırdı.* M.Hüseyn.

2. Az-az, seyrək-seyrək yağmaq, səpələmək (yağış haqqında). *Hava çiləyir. – Çiləyir narın-narın ılıq Bakı yağışı; Bizim qəşəng şəhərin birdir payızı, qışı.* S.Rüstəm. *Artıq gecədən keçmişdi. Arabir yağış çiləyirdi.* S.Vəliyev.

3. *məc.* Səpələmək. *Camaat çayın qırağına gələndə ay yavaş-yavaş özünü göstərdi. Bulanıq suya nə qədər nur çilədisə, onu parıldada bilmədi.* Ə.Vəliyev.

**ÇİLƏNMƏ** "Çilənmək"dən *f.sif.*

**ÇİLƏNMƏK** *f.* 1. Damcı-damcı, sıçrantı halında tökülmək; səpilmək. *Bəzən su damcıları yağış halında fəhlələrin üstünə səpələnir, üz-gözlərinə çilənirdi.* M.Hüseyn. *Yaşar arabir üzünə çilənən* (*f.sif.*) *yağışın soyuqluğunu hiss etmirdi.* M.Rzaquluzadə.

2. *məc.* Səpilmək. *Günəş elə bil ki, aşağı endi; Elə bil, daha gur işıq çiləndi.* N.Xəzri. *Bir yerə buluddan yağış səpələnəndə, o biri yerə günəşdən nur çilənirdi.* B.Bayramov.

**ÇİLƏYƏN, ÇİLƏYİCİ** *is.* Maye çiləmək üçün cihaz; pulverizator. *Kimi əlindəki çiləyiciyə maye tökür, kimi pambıq kollarına dərman çiləyirdi.* (Qəzetlərdən). // Sif. mənasında. *Çiləyici aparatlar zəhərli maddələri məhlul halında bitkinin üzərinə çiləməkdən ötrüdür.* "Çay bitkisi".

**ÇİLİK** b a x **çəlik**. *Qasım əmi istədi ulağı sürə, amma Molla Cəfər əlindəki çilik ilə ulağın başını öz evinə tərəf qaytarıb yapışdı Qasım kişinin yaxasından ki, gərək bizə gedib, mənə qonaq olasan.* C.Məmmədquluzadə.

**ÇİLİK-ÇİLİK** *zərf* Parça-parça, tikə-tikə. ☐ **Çilik-çilik eləmək (doğramaq)** – tikə-tikə etmək (doğramaq). [Fatma xanım:] *Çox artıq danışarsan, durub, hamısını çilik-çilik eylərəm.* N.Vəzirov. **Çilik-çilik olmaq** – tikə-tikə olmaq, sınıq-sınıq olmaq. *Bir də xanın yumruğunun zərbindən pəncərə çilik-çilik olub, yerə səpildi.* Çəmənzəminli.

**ÇİLİKLƏMƏ** "Çilikləmək"dən *f.is.*

**ÇİLİKLƏMƏK** *f.* Qısa-qısa, çilik kimi doğramaq.

**ÇİLİNG**[1] *is.* Çilingağac oyununda pəli vurmaq üçün ağac parçası.

**ÇİLİNG**[2] b a x **çəlik**.

**ÇİLİNGAĞAC** *is.* İki dəstə oyunçunun çiliyi və ya topu ağacla vurub müəyyən məsafəyə çatdırmasından ibarət uşaq oyunu. [Uşaqlar] *yaşıl bir yastanada çilingağac oynamağa başladılar.* Ə.Abasov.

**ÇİLİNGƏR** *is.* Əllə metaldan müxtəlif şeylər qayıran, quraşdıran və ya təmir edən usta. *Avtomobil çilingəri. – Çıxmışdılar yarışa qayışlar, təkərlər; Çıxmışdılar yarışa mədənçi, çilingər.* M.Müşfiq. *Dəmiryol deposunda çilingər şagirdi olan Yunis küləkli bir axşamda yoldaşlarını götürüb, "polad quşa" baxmağa getdi.* Mir Cəlal.

**ÇİLİNGƏRXANA** *is.* Çilingər emalatxanası. *Çilingərxanaların yanında təzə silah bazarı düzəlmişdi.* Mir Cəlal.

**ÇİLİNGƏRLİK** *is.* Çilingərin sənəti, işi, ixtisası. *Yazsam çilingərin iş, hünərindən; Sanki çilingərlik sənətim də var.* S.Vurğun. [Əjdər:] *Mən kitabpaylayana dedim: – Sənətim çilingərlikdir..* S.Rəhman.

**ÇİLLƏ** *is.* 1. Doğuşdan, toydan və ya ölümdən keçən qırxgünlük müddət.

2. Qışın böyük və kiçik çillədən ibarət ilk iki ayı (60 gün). [Mirzə Qoşunəli:] *İndi kimə demək olar ki, sən qışın çilləsində, gecə yarısı get, çıx minarənin başına, oradan azan ver?* Ə.Haqverdiyev. *Qışın çilləsində isti sobanın, közərən buxarının qırağında oturan adam qızmar günləri fikrinə gətirib, damcılı bulağı xatırlayırdı.* S.Rəhimov. ☐ **Böyük çillə** – qışın ilk 40 günü. *Qışın böyük çilləsində qəzadan hava çox xoşdur.* N.Vəzirov. **Kiçik çillə** – qışın böyük çillədən sonra gələn 20 günü. *Kiçik çillənin çıxmağına on gün qalırdı.* C.Məmmədquluzadə.

**ÇİLLİ** b a x **çil-çil**. *Çilli qız. Çilli toyuq.*

**ÇİLOV** *is.* Lobya, mərci, əriştə və düyüdən bişirilmiş aş, plov. *Aşpaz çilovu verir. Molla yeyib görür ki, doymadı.* "M.N.lətif.".

**ÇİLOVPƏZ, ÇİLOVÇU** *is.* Keçmişdə: çilov bişirib satmaqla məşğul olan adam, aşpaz. [Molla Nəsrəddin] *bir az fikirləşəndən sonra dümdüz gedib girir çilovçu dükanına ki: – Bir çilov ver.* "M.N.lətif."**.** [Ağa Mərdan:] *Ağa Kərim, bizim nökərlərdən birisini göndər, bazardan, çilovpəzdən dörd nəfər üçün dörd dümərdi boşqabda, yanınca qəndabı, çilov gətirsin.* M.F.Axundzadə.

**ÇİLSİFƏT(Lİ)** *sif.* Üzündə çil olan; üzü çil-çil. *Çilsifət tibb bacısı elə .. güldü ki, dəhlizə səs saldı.* B.Bayramov.

**ÇİM¹** *is.* 1. Torpağın, kökləri bir-birinə sarışmış sıx ot bitkiləri bitmiş üst qatı, təbəqəsi. // Həmin qatdan kəsilmiş hissə. *Uşaqlardan birisi yamacda çim kəsər, qalanları çimləri çılpaq kürəklərinə qalaq-qalaq yığıb sahilə daşıyar, çayın qolunun suyunu o biri tərəfə döndərərdilər.* İ.Hüseynov.

2. Üzəri cığ və s. su bitkiləri ilə örtülmüş lehməli su qatı. [Konsul] *çim altından baxan qurbağa kimi iri, domba gözlərini qarovulçuya zilləmişdi.* P.Makulu.

**ÇİM²** *əd. dan.* 1. Xalis, qatışığı olmayan və ya çox az olan. *Qərənfil xala Camal əmiyə dörd iri fətir uzadaraq: – Bunları tək-tək qoy, çünki çim süddə yoğurmuşam, kiflənə bilər.* Ə.Vəliyev.

2. Başdan-başa, büsbütün. *Xörək çim yağdır. Bu, ət deyil, çim piydir. – Dəyirmançı baxdı, gördü, bu bir qızdı Allah-taala xoş gündə, xoş saatda yaradıb. Özü də çim qızılın içində.* (Nağıl). [Nəcəf və Əliqulu] *evə qayıtdıqları zaman hər ikisi çim su içində idi.* Q.İlkin.

**ÇİMÇİŞMƏ** "Çimçişmək"dən *f.sif.*

**ÇİMÇİŞMƏK** *f.* 1. İyrənmək, ürəyi götürməmək, ikrah etmək. *Çox yağlı ətdən adam çimçişir. – Həkim yazdığı dərmanı anama çətinliklə içirirdim. Çimçişirdi... Ürəyi götürmürdü.* Mir Cəlal. [Sirat] *lakin qızın çirkinliyini, artıq qarımağa başladığını xatırlayaraq, çimçişib üz-gözünü qırışdırırdı.* Ə.Əbülhəsən.

2. Diksinmək, səksənmək. [Yusif] *birdən çimçişib xəyaldan ayrıldı.* B.Bayramov.

**ÇİMDİK** *is.* İki barmağın ucu ilə birinin ətini tutaraq sıxma; burub çimdikləmə. [Uşaq] *evə getməyə cürət etmədi, atasının yumruğundan və anasının çimdiyindən qorxdu.* Çəmənzəminli. ☐ **Çimdik götürmək (almaq)** – çimdikləmək. *Molla heç bir söz deməyib, Teymura yaxınlaşır***.** *Onun böyründən möhkəm bir çimdik götürür.* "M.N.lətif". **Bir çimdik** – iki və ya üç barmaqla götürülə bilən miqdar; azacıq. [Tələbə] *yumurta boyda bir qırmızı pomidoru yarı bölüb, üstünə bir çimdik duz səpdi.* Qantəmir. [Ana:] *Srağagün də aləmi gəzdim, bir çimdik çay tapa bilmədim.* S.Rəhman.

**ÇİMDİKLƏMƏ** "Çimdikləmək"dən *f.is.*

**ÇİMDİKLƏMƏK** *f.* İki barmağın ucu ilə birinin ətini tutub sıxmaq, incitmək, çimdik

götürmək, çimdik almaq. [Güləndam:] *Ay mürtəd oğlu mürtəd, adamı da elə çimdiklərlərmi?* N.Vəzirov. *Telli arvad birdən yaxınlaşıb, Pərşanın qolundan çimdiklədi..* M.İbrahimov.

**ÇİMDİKLƏŞMƏ** "Çimdikləşmək"dən *f.sif.*

**ÇİMDİKLƏŞMƏK** *qarş.* Bir-birini çimdikləmək.

**ÇİMDİRMƏ** "Çimdirmək"dən *f.is.*

**ÇİMDİRMƏK** *f.* Su, sabun və s. ilə bədənini yumaq; yuyundurmaq, çimizdirmək. *Uşaqları çox vaxt burada* [suaxanda] *çimdirib yuyundurardılar.* H.Sarabski. [Qız] *mətbəxdə su qoydu və anası gələnədək qardaşını çimdirib, başını, bədənini yudu.* H.Seyidbəyli.

**ÇİMƏRLİK** *is.* Sututarı sahilində çimənlər üçün ayrılmış yer, plyaj. *Çimərlikdə adamların istirahəti üçün hər cür şərait yaradılmışdır*. (Qəzetlərdən).

**ÇİMİR: çimir etmək (almaq)** – azca yatmaq, yuxulamaq, yuxusunu almaq, mürgüləmək, mürgü döymək. *Öz-özümə dedim ki, onsuz yaşamaq nədir? Qaçdı gözümdən yuxu, ala bilmədim çimir.* S.Rüstəm. [Veys:] *İndi də, Əziz kişi, bir az işə sən bax, mən çimir eləyim, sonra durub istədiyiniz qədər sizə iş görüm.* Ə.Əbülhəsən.

**ÇİMİŞMƏ** "Çimişmək"dən *f.sif.*

**ÇİMİŞMƏK** *qarş.* Hamı bir yerdə çimmək. *Soruşacaqsınız ki, .. uşaqlar şirin çimişdikləri yerdə niyə sudan çıxdılar, niyə Musa dayının səfəri ilə maraqlandılar?* Mir Cəlal.

**ÇİMİZDİRMƏ** "Çimizdirmək"dən *f.sif.*

**ÇİMİZDİRMƏK** b a x **çimdirmək**. [Qəhrəman] *bəzən suyun ılıq olduğunu görərək, uşağı çayın nisbətən dərin və dalda bir yerində çimizdirirdi*. S.Rəhimov. *Miyançızadə əvvəlcə Nuriyevin uşaqlarını çimizdirdi, sonra kamali-səliqə ilə Nuriyevə kisə çəkdi və yuyundurdu.* Ə.Vəliyev.

**ÇİMKİRMƏ** "Çimkirmək"dən *f.sif.*

**ÇİMKİRMƏK** b a x **çımxırmaq**. *Mən qırmızı fəs deyiləm, bu başdan o başa qoyulam, ay Müqim! – deyə Zərintac xanım çimkirdi.* S.Rəhimov.

**ÇİMLƏMƏ** "Çimləmək"dən *f.sif.*

**ÇİMLƏMƏK** *f.* Çimlə örtmək (b a x **çim**¹).

**ÇİMLİ** *sif.* Çimi olan, çim basmış, çimlə örtülmüş (b a x **çim**¹). *Çimli gölməçə. Çimli nohur.*

**ÇİMMƏ** "Çimmək"dən *f.sif.*

**ÇİMMƏK** *f.* Yuyunmaq. *Vannada çimmək.* – [Məşədi İbad:] *Kişinin hamamında iki saatdır ki, müftə çimibsiniz, hələ bir durub cəncəl də salırsınız?* Ü.Hacıbəyov. // Sərinlənmək, yuyunmaq və b. məqsədlə suya girmək. *Çayda çimmək. – Dənizdə bir qız çimdi; Saçı qara, özü gözəl.* N.Rəfibəyli. // Obrazlı təşbehlərdə. *Şam meşələri dalından yenicə çıxmış Ay sarı saçlarını Qara dənizin mavi sularına töküb çimirdi.* M.S.Ordubadi. *Ay çimirdi sularda, hava sakit, hava xay; Nədənsə lal axırdı Amudərya – dəli çay.* S.Rüstəm.

**ÇİN**¹ *is.* Taxıl, ot və s. biçmək üçün qısadəstəli, dişli, yarımdairəvi kənd təsərrüfatı aləti; dişli oraq. *Çinlə ot biçmək. – Şuma vacibdi çünki beş cüt kəl; Biçinə çin gərəkdir, xırmana vəl.* S.Ə.Şirvani. *Götürüb kəndlilər hərə bir çin; Başlanıbdır taxıllar içrə biçin.* A.Səhhət.

**ÇİN**² *is. dan.* Dəfə, kərə. [Zeynal:] *Məni dünya tanıyır. Sözü bir çin söyləyərəm.* C.Cabbarlı.

**ÇİN**³ *is. dan.* Təbəqə, qat, lay. // Qalaq, yığın. *Dədə, mən də ocağın gözünə odun gətirmişəm – deyə üstəlik olaraq Həzi də çindən odun gətirir.* S.Rəhimov. // Sıra. *Ləməyə iki çin əlvan zərli çini kasa və boşqab düzülərdi.* H.Sarabski.

**ÇİN**⁴ *zərf dan.* Düz, doğru, düzgün. ☐ **Çin çıxmaq** – doğru olmaq, düzgün olmaq, düz çıxmaq. *Səlimnaz arvad yuxusunun çin çıxdığını görüb hönkürdü.* M.Hüseyn.

**ÇİN**⁵ [*rus.*] Rütbə, vəzifə, xidmət dərəcəsi. [Xortdan:] *Əvvələn, oğlun həştad min tümən pul verib, bir yaranallıq çini aldı.* Ə.Haqverdiyev. // *dan*. Poqon. ☐ **Çini düşmək** *zar. kin.* – vəzifədən düşmək, hörmətdən düşmək, daha sayılmamaq.

**ÇİNAR** *is. bot.* Yaşıl-boz rəngli qabığı və enli pəncəvari yarpaqları olan iri, hündür ağac. *Dörd yanında bitib söyüdlə çinar; Üzər ol göldə qazlar, ördəklər.* A.Səhhət. *Ucaqamətli Nabat qoca çinarın kölgəsində durub Şəkərəlini gözləyirdi.* T.Ş.Simurq.

**ÇİNARLIQ** *is.* Çoxlu çinar ağacı bitmiş yer. *Çinarlıqda yalnız başıma gəzdim; Bu halda incə bir inilti sezdim.* H.Cavid.

**ÇİNBƏÇİN** *zərf* Çin-çin, qat-qat, sıra ilə, səliqə ilə. *Kitabları çinbəçin düzmək. – Qıvrım-qıvrım, həlqə-həlqə, çinbəçin; On dörd zülfün gördüm bel kənarında.* "Qurbani".

**ÇİNCƏ** *sif.* və *zərf* Çin dilində. *Çincə-rusca lüğət. Çincə danışmaq.*

**ÇİN-ÇİN** *sif.* və *zərf* Qat-qat, təbəqə-təbəqə, lay-lay, üst-üstə. *Çin-çin yığılmış odun. – Taxçalarda xırda mücrülərin üstündən əlvan, çin-çin ipək boğçalar qoyulardı.* H.Sarabski. *Kəpəzdən yüksələn çin-çin buludlar; Əriyib yamaca sığınır hərdən.* N.Xəzri.

**ÇİNƏDAN** *is.* [*fars.*] Quşlarda, həşəratlarda və molyusklarda qidanın toplanması üçün qida borusunun yoğun hissəsi. [Qızılquş] *öz balalarını ilk vaxtlarda çinədanında yumşaltdığı ətlə, sonralar kiçik quşlarla yemləyir.* "Zoologiya".

◊ **Çinədanı dolu olmaq** – deməyə çox sözü olmaq, ürəyi sözlə dolu olmaq. **Çinədanına yığmaq** – eşitdiyi söhbəti yadında saxlamaq. *Şəmsi qulağını şəkləyib, deyilənləri bir-bir çinədanına yığırdı.* M.Süleymanov. **Çinədanını boşaltmaq** – ürəyindəki sözü demək, danışmaq. [Fəridə Fərəcə:] *Yox, sən də çinədanını boşalt.* Ə.Məmmədxanlı.

**ÇİNİ** *is.* [*coğr. addan*] Müxtəlif məmulat istehsal etmək üçün istifadə olunan əla gildən hazırlanmış süni mineral kütlə. // Həmin kütlədən hazırlanmış. *Çini boşqab. – Qasid gəldi haf kimi; İncəlmişdi sap kimi; Gözlə, yarın qəlbini; Qırma çini qab kimi.* (Bayatı). *Çalsaqqal kişi bir çini qab su gətirdi..* Mir Cəlal. [Həmzə] *ağ, böyük çini abajurlu otuzluq lampanı nəzərdən keçirib qeyzlə dedi..* Ə.Əbülhəsən.

**ÇİNLƏMƏ¹** "Çinləmək¹"dən *f.is.*

**ÇİNLƏMƏ²** "Çinləmək²"dən *f.is.*

**ÇİNLƏMƏK¹** *f.* Çinlə biçmək. *Otu çinləmək.*

**ÇİNLƏMƏK²** *f.* Çin-çin düzmək, səliqə ilə lay-lay yığmaq, qalamaq, qalaqlamaq. *Pulu ancaq yaraşır çinləyəsən sənduqə; Nə ki, xərc eyləyəsən millətə, dindaşa, ətə.* M.Ə.Sabir. *Qərənfil xala odunu eyvanın bucağına çinlədi.* Ə.Vəliyev.

**ÇİNLƏNMƏ¹** "Çinlənmək¹"dən *f.sif.*

**ÇİNLƏNMƏ²** "Çinlənmək²"dən *f.sif.*

**ÇİNLƏNMƏK¹** *məch.* Çinlə biçilmək. *Zəmi çinləndi.*

**ÇİNLƏNMƏK²** *məch*. Çin-çin düzülmək, bir-birinin üstünə yığılmaq; qalanmaq. *Dərənin içinə basdırılacaq payalar bir tərəfə çinlənir, qum ələnir, əhəng, torpaq bir qırağa təllənirdi.* Ə.Vəliyev.

**ÇİNLİ** *is.* Çin Xalq Respublikasının əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam. *Puan Qay çinliləri ayıq salır, onlara edilən zülmü öz oyunları ilə nümayiş etdirir.* S.S.Axundov.

**ÇİNÓVNİK** [*rus.*] 1. İnqilabdan əvvəlki Rusiyada: dövlət xidmətçisi, məmur. *Polis çinovniki. Məhkəmə çinovniki. – Belə söyləyənlər də vardı ki, bir çox çinovniklər qaçaqlarla əlbir idilər, ola bilsin ki, belə də olaydı, çünki çar hökumətinə hər nə desən yaraşardı.* E.Sultanov. [Maarif nazirliyinin] *fikir və xəyalı soldatlar kimi naçalniklərin, rəislərin hökmünə tabe və əmrinə müti çinovniklər hasilə gətirmək olubdur.* F.Köçərli.

2. *dan.* İşin həllində canlı iştirak etməyərək, vəzifəsini ancaq formal yerinə yetirən vəzifəli şəxs haqqında.

**ÇİNŞÜNAS** *is.* Çinşünaslıq mütəxəssisi; sinoloq.

**ÇİNŞÜNASLIQ** *is.* Çin dili, ədəbiyyatı, tarixi və mədəniyyətini öyrənən elmlərin məcmusu; sinologiya.

**ÇİRİŞ¹** *is. bot.* Zanbaq fəsiləsinə mənsub yabanı bəzək və tərəvəz bitkisi. *Azərbaycanın bir çox rayonlarında yerli əhali çirişdən tərəvəz kimi istifadə edir.* "Elm və həyat".

**ÇİRİŞ²** *is.* Pinəçi yapışqanı.

**ÇİRK** *is.* [*fars.*] 1. Natəmizlikdən, vaxtlıvaxtında yuyulmamaqdan bədəndə, paltarda və s.-də əmələ gələn xoşagəlməz ləkə qatı; kir. *Paltarın çirkini yumaq. – Armud ağacının dibində palaz salınıb və üstündə çirkdən qaralmış samovar qaynayırdı.* Çəmənzəminli. // *sif.* Çirkli, çirki olan, kirli. *Çirk köynək. Çirk yaylıq.*

2. B a x **irin**. *Yaranın çirki.* □ **Çirk eləmək** – irinləmək. *Yara çirk elədi.*

**ÇİRKAB** *is.* [*fars.*] Çirk sular, natəmiz sular. *Bütün çirkab və zibillər bu göllərə töküldüyü üçün yayda üfunətdən və ditdili*

*əlindən qəsəbə əhalisi zinhara gəlirdi.* Ə.Vəliyev.

**ÇİRKƏTAB** *sif.* Tündrəngli olduğu üçün çirki görünməyən, tez çirklənməyən, çirkə davamlı (paltar, parça və s. haqqında). *Çirkətab parça.*

**ÇİRKGÖTÜRƏN** *sif.* Rəngi açıq olduğu üçün tez çirklənən (parça və s. haqqında). *Çirkgötürən parça.*

**ÇİRKGÖTÜRMƏYƏN** bax **çirkətab**.

**ÇİRKİN** *sif.* 1. Gözəl olmayan, gözə, qulağa xoş gəlməyən: kifir, eybəcər, bədləkər. *Çirkin üz. Çirkin səs.* – [Məşədi İbad:] *İnsanın zahiri nə qədər çirkin olsa, batini bir o qədər gözəl olar.* Ü.Hacıbəyov. [Məşədi Fatma ərinə:] *Sən yaxşı bilirsən ki, böyük qız çirkin olub, evdə qalıb, o, elə bədbəxt olub, .. bu da belə bədbəxt olsun?!* Çəmənzəminli.

2. Çirk, çirkli, kirli, natəmiz. *Çirkin otaq. Çirkin yorğan-döşək.*

3. *məc.* Yaramaz, ləyaqətsiz, xoşagəlməz, pis. *Çirkin iş.* – [Zabit:] *O çirkin hərəkətim yadıma düşəndə indi də tüklərim başımda biz-biz olur..* E.Sultanov. *Çirkin əməllərin özü gizləyir; Söz tutmur dodağı, məni pisləyir.* Aşıq Hüseyn.

**ÇİRKİNLƏŞMƏ** "Çirkinləşmək"dən *f.is.*

**ÇİRKİNLƏŞMƏK** *f.* Gözəlliyini itirmək, kifirləşmək, eybəcərləşmək, çirkin şəklə düşmək. *Elə bir vaxt oldu ki, qız solmağa, çirkinləşməyə üz qoydu.* M.Hüseyn.

**ÇİRKİNLİK** *is.* 1. Kifirlik, eybəcərlik; çirkin adamın, şeyin və s.-nin halı. [Sevda:] *Çirkinliyim etdirməsin ikrah; Könlüm səni öpmək dilər..* H.Cavid. *Hacı Tağı Allahqulunu şirnikdirmək üçün ərə getmək vaxtı çoxdan keçmiş, çirkinlikdə özünə oxşayan təkcə qızını da* [nökərə] *verməyi vəd etmişdi.* Ə.Əbülhəsən.

2. *məc.* Yaramazlıq, alçaqlıq, pislik, rəzillik. [Xosrov:] *Nə üçün bu bədbəxt məmləkətdə olan bütün çirkinlikləri mənə göstərdin?* A.Şaiq. [Qaraş] *inanırdı ki, ata haqqında pis düşünmək ən böyük xəyanət və çirkinlikdir.* M.İbrahimov.

**ÇİRKLƏNDİRİCİ** *sif.* Çirk edən, xarab edən, kirləndirən, korlayan. *Maşınlar çirkləndirici qazlar buraxır. – Son illər sənayenin coşqun inkişafı ilə əlaqədar olaraq havaya buraxılan çirkləndirici maddələr atmosferin .. dəyişməsinə səbəb olmuşdur.* (Qəzetlərdən).

**ÇİRKLƏNDİRMƏ** "Çirkləndirmək"dən *f.sif.*

**ÇİRKLƏNDİRMƏK** *f.* Çirk etmək, kirləndirmək. [Hafizə xanım:] *Tut bu paltarları, saxla, çirkləndirməyəsən.* Ə.Haqverdiyev.

**ÇİRKLƏNMƏ** "Çirklənmək"dən *f.sif.*

**ÇİRKLƏNMƏK** *f.* Çirk olmaq, çirkli olmaq, kirlənmək. *Bunlar əmmamələrini dəsmala büküb qoymuşdular başlarına ki, çirklənməsin və tozlanmasın.* Ə.Haqverdiyev. *Adətən üst-başı dəmir pası və yağdan çirklənmiş* (f.sif.), *paltarları yamaqlı olan fəhlələr yavaş-yavaş işə başlayır*(*lar*).. M.İbrahimov.

**ÇİRKLİ** *sif.* Təmiz olmayan, çirki olan; kirli. [Fərhad:] *Bu gələn kişilərin tozlu, çirkli ayaqları çox adamın ürəyindən təmizdir.* Ə.Haqverdiyev. [Nənəxanım] *bir də geri qayıtdı, əsnəyə-əsnəyə dalına bir çirkli və cırıq yorğan salıb oturdu.* Çəmənzəminli.

**ÇİRKLİ-PASLI** *sif.* Üz-gözünü, üstbaşını çirk basmış; pinti, səliqəsiz.

**ÇİRK-PAS(AQ)** *top. dan.* Çirk, kir. [Kərbəlayı Nəsir:] *Əşi, insaf ilə danışaq, tozun-torpağın içində işləyirsən, çirkə-pasağa batırsan, bəs sonra harda gəlib təmiz olursan?* Ü.Hacıbəyov.

**ÇİRTMƏK** bax **çırtıq** 1-ci mənada.

**ÇİS** *is.* 1. Duman şəklində yağış; kiçicik yağış damcısı.

2. Tutqun hava.

**ÇİSƏK** bax **çiskin**.

**ÇİSƏLƏMƏ** "Çisələmək"dən *f.sif. Lal, çisələmə yağışın ardı-arası kəsilmədi.* İ.Hüseynov.

**ÇİSƏLƏMƏK** bax **çiskinləmək**. *Gündüz hava tutqun olmuş, indi isə çisələyirdi.* Ə.Vəliyev. *Yağış çisələyər şəhərə, kəndə; Döyər zirvəsini dolu dağların.* B.Vahabzadə.

**ÇİSKİN** *is.* Tutqun havada narın yağış: çisək. *Yağış get-gedə yavaşıyıb, çiskinə çevrildi.* İ.Əfəndiyev. *Qaranlıq idi, çiskin yağış yağırdı..* S.Rəhman. // Sif. mənasında. *Çiskin hava.*

**ÇİSKİNLƏMƏ** "Çiskinləmək"dən *f.is.*

**ÇİSKİNLƏMƏK** *f.* Tutqun havada narın yağış yağmaq; çisələmək. *Bərk duman olduğu üçün çiskinləyirdi.* Ə.Vəliyev.

**ÇİSKİNLİ** *sif.* Çiskin. *Payızın çiskinli, dumanlı günü az-az ayazıyırdı.* S.Rəhimov. *Bu gün xoş, günəşli, laləzar olan hava sabah buludlu, küləkli, çiskinli bir hal alır.* M.Rzaquluzadə.

**ÇİT** *is.* Basma güllü və ya saya yüngül pambıq parça. *Gülnaz ucuzqiymətli çitdən sadə paltar geyirdi.* T.Ş.Simurq. [Gülçöhrə:] *Bu cür çitin arşınını biz həmişə səkkiz qəpikdən alırıq.* Ü.Hacıbəyov. // *sif.* Həmin parçadan tikilmiş. *Çit köynək. – Bir il bundan əvvəl kəndlərində yoldaşlarının çit libasına həsrət aparan Gülpəri indi ipək paltarda, üst-başı qızıl və cavahirat ilə bəzənmiş kəndlərinə qayıdacaqdı.* S.S.Axundov. *Qaratel sadə çit don geyib, başına ağ krepdeşin örpək örtmüşdü.* Ə.Əbülhəsən.

**ÇİTƏK** *is.* Yamaq.

**ÇİTƏ(LƏ)MƏ** "Çitə(lə)mək"dən *f.sif.*

**ÇİTƏ(LƏ)MƏK** *f.* Deşiyi, yırtığı calayıb tikmək; yamamaq.

**ÇİV(İ)** *is.* Hər hansı qurğuda, mexanizmdə, maşında və s.-də hissələri bir-birinə birləşdirən detal; dilçək, şpon. *Aparan çarxların topu ilə yarımoxlar konus səthi üzərində olan çivi və ya flans vasitəsilə bir-birinə birləşdirilir.* Ə.Əlizadə.

**ÇİVLƏMƏ** "Çivləmək"dən *f.sif.*

**ÇİVLƏMƏK** *f. xüs.* Çivlə bir-birinə bənd etmək, bağlamaq.

**ÇİVZƏ** *is.* Sızanaq.

**ÇİVZƏLİ** *sif.* Çivzə (sızanaq) basmış; sızanaqlı.

**ÇİY** *sif.* 1. Bişməmiş, bişirilməmiş, qaynadılmamış. *Çiy ət. Çiy süd. Çiy su.* □ **Çiy kərpic** – palçıqdan tutulmuş, bişirilməmiş, xam kərpic. *Bina çiy kərpicdən tikilmiş və ağardılmışdı.* M.İbrahimov. // Yaxşı bişməmiş, yarıbişmiş, ala-bişmiş. *Xörəyin əti çiydir.*

2. *məc.* Tutqun, açılışmamış, kal. *Növbətçi qadın mürgüdən hövlnak ayıldığını göstərən tutqun və çiy bir səslə cavab verdi.* M.Hüseyn.

3. *məc.* Yersiz, münasibətsiz. *Çiy söz.*

4. *məc.* Yetişməmiş.

**ÇİYAN** *is. zool.* Çoxayaqlılar sinfindən kiçik, zəhərli heyvan; skolopendra.

**ÇİYƏLƏK** *is. bot.* Ağ çiçəkləri, çəhrayı-qırmızı rəngli ətirli meyvəsi olan çoxillik ot bitkisi və bu bitkinin meyvəsi. *Fərman yoldaşları ilə meşəyə çiyələk yığmağa gedər, çəmənlərdə oynar, dağlara dırmaşardı.* Ə.Sadıq.

**ÇİYİD** *is.* Pambıq toxumu. [Həyat:] *Çiyidin necə təmizlənib hazırlandığını .. yoxlayırıq.* M.İbrahimov. [Xanpəri] *istəyirdi ki, bütün işləri özü görsün, bütün çiyidi özü səpsin.* Ə.Vəliyev.

**ÇİYİDSƏPƏN** *sif. k.t.* Çiyid səpməyə məxsus. *Traktora qoşulmuş çiyidsəpən maşın dünəndən sahədə idi.* Ə.Vəliyev. *Mexanizatorlar az vaxtda altı ağır malanı, beş çiyidsəpən maşını, beş traktoru təmir edib saz hala salmışlar.* // *İs. mənasında.* Çiyidsəpən maşın. *Çiyidsəpəni təmir etmək. Yeni markalı çiyidsəpən.*

**ÇİYİN** *is.* Bədənin boyundan qollara qədər olan hissəsi. *Ağır bir sükutun qəsəbədə hökm sürdüyünü görən Leylək çiynindəki beşaçılan tüfəngini hərləyib əlinə aldı..* S.Rəhimov. *Bir daha xarabalığı gözdən keçirdikdən sonra qocaya tərəf dönüb, əlini onun çiyninə qoydu.* Ə.Məmmədxanlı. // Geyimin haman yeri örtən hissəsi. *Paltonun çiyni.* – [Uşağın] *gözünün yaşı pencəyimin çiynini islatmışdı..* M.S.Ordubadi. □ **Çiyninə aşırmaq** – qaldırıb çiyninə qoymaq. *Tapdıq xurcunu götürüb çiyninə aşırdı.* Ə.Vəliyev.

◊ **Çiynindən (çiyinlərindən) ağır yük götürülmək** – b a x **çiynindən (çiyinlərindən) dağ götürülmək**. **Çiynindən (çiyinlərindən) dağ götürülmək** – üzərindən ağır yük götürülmək, ağır, məsuliyyətli bir işdən azad olmaq. *Birdən mən* [qadını] *tanıyarkən elə bil çiynimdən ağır bir dağ götürüldü.* Ə.Məmmədxanlı. **Çiyninə (çiyinlərinə) düşmək** – üzərinə, öhdəsinə düşmək, görməli olmaq. **Çiynini (çiyinlərini) atmaq (çəkmək)** – narazılığını və ya bir işdən xəbəri olmadığını bildirmək əlaməti olaraq çiyinlərini tərpətmək. *Seyran çiyinlərini atdı: – Bilmirəm, – dedi.* Q.İlkin. *Frosya çiyinlərini çəkib, dodaqlarını büzdü.* H.Seyidbəyli.

**ÇİYİNBƏÇİYİN** b a x **çiyin-çiyinə**. *Çiyinbəçiyin işləmək.*

**ÇİYİN-ÇİYİNƏ** *zərf* 1. Birgə, birlikdə, bir yerdə.

2. Yan-yana, yanakı. *Ədəblə dayanıb çiyin-çiyinə; Heç biri gətirməz bir söz dilinə.* Şəhriyar.

**ÇİYİNLİK** *is.* Paltarın altından çiyinə qoyulan balışcıq. *Çiyinləri çox ensiz olan qadınlar çiyinlik qoymaqla çiyin xəttini süni surətdə uzada bilərlər.* "Az. qad.".

**ÇİYNİDÜŞÜK** *sif.* 1. Çiyinləri və ya bir çiyni aşağı olan, sallaq çiyinli.

2. *məc.* Maymaq, ağzıaçıq.

**ÇİYRƏNDİRMƏ** "Çiyrəndirmək"dən *f.sif.*

**ÇİYRƏNDİRMƏK** *f.* Ürəyini vurmaq, iyrəndirmək, bıqdırmaq, ikrahlandırmaq, ikrah hissi oyatmaq.

**ÇİYRƏNMƏ** "Çiyrənmək"dən *f.sif.*

**ÇİYRƏNMƏK** *f.* Bir işi çox görməkdən, yaxud bir şeyi çox yeməkdən təngə gəlmək, ikrahlanmaq, iyrənmək, ürəyini vurmaq. *Çox vaxt adam yağlı plovdan çiyrənər, iştahası soğan-çörək yemək çəkər.* S.Hüseyn. [Çəpəl:] [Qıssa] *ağ əppəyi yaxın qoymur ki, çiyrənmişəm, iyrənirəm.* Mir Cəlal.

**ÇİZGİNMƏK** *f.* bax **çimçişmək**.

**ÇOBAN** *is.* [*fars.*] Qoyun-keçi sürüsünü otaran adam. *Sürü-sürü qoyunları çoban yamacda otladar; Alar ələ papağını, oxur şikəstə, fit çalar.* A.Səhhət. *Çobanlar bəzən qucaqlarındakı əkiz quzunu soyuqdan qorumaq üçün ərklə Səfər kişinin mənzilinə gətirirlər.* Mir Cəlal.

◊ **Çoban qoyunu qırxan kimi qırxmaq** – var-yoxunu əlindən almaq.

**ÇOBANALDADAN** *is. zool.* Uçarkən teztez yerə qonan bozrəngli, uzunquyruqlu quş; çobanquşu.

**ÇOBANAŞI** *is.* Azərbaycanın müxtəlif yerlərində müxtəlif şəkildə suda və ya süddə bişirilən aş. *Qurban .. obalara gedib süd almalı və ağalar üçün çobanaşı bişirməli idi.* T.Ş.Simurq.

**ÇOBANBAYATI(SI)** *is. mus.* Tütəkdə çalınan xalq havalarından birinin adı. *Şikəstəm, segahım, çobanbayatım; Bir şərbət dadıyır ağızda, dildə.* S.Vurğun.

**ÇOBANBOZARTMASI** *is.* Ətdən bişirilən bozartma növü.

**ÇOBANÇİÇƏYİ** *is. bot.* Hündürlüyü bir metrə qədər olan çoxillik ot bitkisi.

**ÇOBAN-ÇOLUQ** *top.* Keçmişdə: yuxarı təbəqədən olanların aşağı təbəqəyə mənsub olanlara verdikləri təhqiramiz ad. *Çoban-çoluq oğlu bəy ilə bahəm olubdur; hamını bəyənməz.* M.Ə.Sabir. [Xan:] *Çoban-çoluq yardımı mənə gərəkməz!* M.Rzaquluzadə.

**ÇOBANƏPPƏYİ** *is. bot.* Yabanı halda bitən, kəklikotuna oxşar yeyilən ot bitkisi.

**ÇOBANI** *is.* Əldə çomaqla oynanılan cəld rəqs; çobanlar rəqsi. [Dostlar] *çobanı oynayırlar.* (Qəzetlərdən). // Həmin rəqsin musiqisi. *Çobanı çalmaq.* // Çobanbayatısı.

**ÇOBANİTİ** *is.* Sürünü qorumaq üçün saxlanılan iri, güclü it cinsi. *Boz çobanitiləri yüyürüb furqonun dal-qabağında hoppanır, hürüşürdülər.* Mir Cəlal.

**ÇOBANQUŞU** bax **çobanaldadan**. *Üç addımlıqdan vəhşi bir çobanquşu qalxdı.* H.Nəzərli.

**ÇOBANLIQ** *is.* Çobanın işi, peşəsi. *Səksən yaşına kimi dağda-aranda çobanlıq eləyib, ağlı-qaralı buludlarla qol-boyun yatan .. Əmiraslan baba .. söhbət edirdi.* S.Rəhimov.

**ÇOBANTOXMAĞI** *is. bot.* Çoxlu saçaqlı kökləri olan çoxillik ot bitkisi. *Çobantoxmağı .. gövdəsi 60 sm-ə qədər hündürlüyündə, seyrək çim əmələ gətirən çoxillik bitkidir. Kökümsovu qalındır, qısadır, sürünəndir, üzərində külli miqdarda nazik saçaqlı köklər əmələ gəlir.* H.Qədirov.

**ÇOBANTOPPUZU** *is. bot.* Əsasən yabanı halda bitən, bəzən də yem bitkisi kimi əkilib-becərilən çoxillik ot bitkisi. *Otlağın dincə qoyulduğu ikinci ildə yapışqan yonca, çobantoppuzu, ala-bəzək dəlicəotu, alçaqboylu çilot kimi qiymətli yem bitkilərində çiçək zoğlarının miqdarı 10-18 dəfə artır.* (Qəzetlərdən).

**ÇOBANTÜTƏYİ** *is. mus.* Tütəyin ən sadə növü. [Fəsli oğlan:] *..Çobantütəyindən yapışanları musiqişünas hesab etmirəm!* M.İbrahimov.

**ÇOBANULDUZU** *is.* Venera (Zöhrə) planetinin xalq arasında işlənən adı. [Şərəf:] *Çobanulduzunumu deyirsən, ay bala?* [Salman:] *Onu deyirəm.* Ə.Haqverdiyev.

**ÇOBANYASTIĞI** *is. bot.* Mürəkkəbçiçəklilər fəsiləsindən xırda sarı çiçəklər açan birillik ot bitkisi. *Məğrur lalə, xumar nərgiz, həsrət bənövşə, çobanyastığı və başqa çiçəklər səhər nəsiminin ahəngilə yırğalanır..* (Qəzetlərdən).

**ÇOCUQ** *is.* Uşaq. *Ey dərbədər gəzib ürəyi qan olan çocuq! Bir loğma nan üçün gözü giryan olan çocuq!* M.Ə.Sabir. *Məktəb çocuqları yenə də yaxınlaşıb Əsədi əhatə etdilər.* B.Talıblı.

**ÇOCUQLUQ** *is.* Uşaqlıq. [Sitarənin] *zahir və batinində çocuqluq əsərləri məhv olub gedirdi.* Çəmənzəminli. *Bu sonuncu kəlmələr qaraüzlü həbəşə çocuqluq dastanını xatırladırdı.* H.Nəzərli.

**ÇODAR** *is.* Keçmişdə: mal-qara alveri ilə məşğul olan adam. [Koroğlu dedi:] *Çodaram, qoyun almaq istəyirəm.* "Koroğlu". *Cəlil ağa cavab verdi ki, çodardır, şəhərə mal gətirib, sabahı gözləyir..* İ.Musabəyov.

**ÇODARLIQ** *is. köhn.* Çodarın peşəsi, işi.

**ÇOX** *sif.* və *zərf* 1. Sayca az olmayan; miqdarı artıq olan (*az* ziddi). *İclasda çox adam iştirak edirdi.* – [Sultan bəy:] *..Yaşım çoxdur, pulum da azdır.* Ü.Hacıbəyov. □ **Çox az** – lap az, olduqca az, cüzi. *Çox az pul. Çox az vaxt qalıb.* // Az sürməyən, uzun müddət davam edən, uzun sürən; sürəkli. *Danışıq çox çəkir, verilir qərar.* R.Rza. // Tez-tez, bol-bol, çoxlu. *Bakıda külək çox əsir. Belə təsadüflər çox düşür. Dostumla çox görüşürəm.*

2. Xeyli, artıq, artıq dərəcədə, olduqca. *Məhərrəm bu təsadüfdən çox sevindi.* H.Nəzərli. *Muxtar çox düşünmüş, götür-qoy eləmiş, nəhayət, Çiçəyi ürəkdən sevmişdi.* Ə.Vəliyev.

3. Sifət və zərflərdən əvvəl gələrək onların mənasını qüvvətləndirir. *Çox bərkdən danışmaq. – Qara pəhləvan gördü, yox, hərif çox qüvvətlidir.* "Koroğlu". *Qarı bu qoca müəllimi çox yaxşı tanıyırdı.* S.Qədirzadə.

4. *İs. mənasında.* Çoxluq, əksəriyyət. *Az çoxa tabedir.*

5. **Çoxları, çoxusu** şəklində *is.* – əksəriyyəti, böyük qismi. *Fəhlələrin hamısı .. qolları və baldırları çirməli, .. çoxusu başıaçıq işləyirdilər.* E.Sultanov. *Çoxları birağızdan danışmağa başladı.* M.Hüseyn.

◊ **Nə az, nə çox** – b a x **az**.

**ÇOX-ÇOX** *zərf* və *sif.* 1. Lap çox, olduqca çox, olduqca. [Məmməd:] *..Vətənim çox-çox uzaq bir diyardadır.* E.Sultanov. *Zəhm və qorxu uşaqlıq illərilə birgə çox-çox uzaqlarda qalmışdı.* İ.Hüseynov.

2. Çoxlu, olduqca çox, dönə-dönə. *Şairlər, rəssamlar günün batmasını çox-çox təsvir etmişlər.* M.Rzaquluzadə. [Bülənd:] *Demək, yoldaşlar, burada biz hələ çox-çox iş görməliyik...* Ə.Əbülhəsən.

**ÇOXALDILMA** "Çoxaldılmaq"dan *f.sif.*

**ÇOXALDILMAQ** *məch.* Sayca, miqdarca artırılmaq, çox edilmək. *Xərclər çoxaldılmışdır.*

**ÇOXALLAHLILIQ** *is.* Çoxlu allahların mövcud olduğunu qəbul edən din; politeizm (*təkallahlılıq* əksi).

**ÇOXALMA** "Çoxalmaq"dan *f.sif.*

**ÇOXALMAQ** *f.* Miqdarca, sayca, həcmcə və s. artmaq. *İşimiz çoxalmışdır. Mədəni tələbat getdikcə çoxalır. – Maşınlar, insanlar dağılır düzə; Çoxalır səhrada gediş-gəliş də.* S.Vurğun. *Günlər keçdikcə Usta Qiyasın fikri daha da çoxalır.* M.İbrahimov.

**ÇOXALTMA** "Çoxaltmaq"dan *f.sif.*

**ÇOXALTMAQ** *f.* Sayca, miqdarca, həcmcə və s. artırmaq, çox etmək. *Məhsulu çoxaltmaq. Sayını çoxaltmaq.* – [Muradın] *müəyyən bir planı da vardı; toyuqlarını çoxaldacaq, keçiləri doğub törəyəcək, keçən payızda aldığı düyəsi gələn il bala verəcəkdi.* S.Hüseyn. *Fərman çalışmaq sayəsində gündən-günə qazıdığı torpağın miqdarını çoxaldırdı.* Ə.Sadıq.

**ÇOXARVADLI** *sif.* Eyni zamanda bir neçə arvadla nikahı olan, bir neçə arvadı olan. *Çoxarvadlı kişi.*

**ÇOXARVADLILIQ** *is.* 1. Kişinin eyni zamanda bir neçə arvadla nikahı olan nikah forması; poliqamiya.

2. Eyni zamanda bir neçə arvadla nikahı olma, bir neçə arvadı olma.

**ÇOXATLI** *sif.* Bir neçə at qoşulmuş, bir neçə atla sürülən (araba və s. haqqında). *Atlardan çoxatlı arabalarda istifadə edilir və onların münasib qoşqu ləvazimatı olur.* "Atçılıq qabaqcılları".

**ÇOXATOMLU** *sif. xüs.* Bir neçə atomu olan, bir neçə atomdan ibarət olan. *Çoxatomlu spirt. Çoxatomlu üzvi birləşmə.*

**ÇOXAYAQLILAR** *cəm zool.* Çoxlu ayaqları olan qurdvari bədənli heyvanların böyük qisminin adı. *Xərçəngləri, hörümçəkləri, çoxayaqlıları və cücüləri buğumayaqlılar adlandırırlar.* "Zoologiya".

**ÇOX-AZ** b a x **az-çox**. *Qane olub həyatda; Çoxa-aza Füzuli; Qocaldı, dərdlərini; Yaza-yaza Füzuli.* B.Vahabzadə.

**ÇOXBİLƏN** *sif.* və *is.* Həyat təcrübəsi, biliyi çox olan. *Çoxbilən qoca.*

**ÇOXBİLMİŞ** *sif.* və *is.* b a x **çoxbilən**. [Tutubəyim ağa] *qızının dayə ilə pıçıldaşdığını görüb: – Yenə o çoxbilmiş qız nə soruşur? – deyə gülümsündü.* Çəmənzəminli. [Şərəfoğlu:] *Rüstəm kişi, bu indiki cavanlar özlərini çoxbilmiş* (z.) *hesab edirlər.* M.İbrahimov. // *məc.* Bic, hərif, hiyləbaz. *Çoxbilmişin biridir.*

**ÇOXBİLMİŞLİK** *is. dan.* Biclik, hiyləbazlıq. *..Səkinə ərinin izzəti-nəfsi ucundan necə çoxbilmişliyə əl atdığına güldü.* M.İbrahimov.

**ÇOXBUCAQLI** *sif.* Çoxlu bucağı olan. *Çoxbucaqlı məqbərə.* // *is.* Dörddən artıq bucağı olan həndəsi fiqur.

**ÇOXBUĞUMLU** *sif.* Çoxlu buğumdan ibarət olan, çoxlu buğumu olan. *Çoxbuğumlu qurd.* – [Bu sortun] *gövdəsi çox tüklüdür, dirsəkli və çoxbuğumludur.* "Pambıqçılıq".

**ÇOXCA** *sif.* və *zərf* Çoxlu, lap çox, olduqca çox, bolluca. *Çoxca yemək. – Çığırma, yat, ay ac toyuq, yuxunda çoxca darı gör!* M.Ə.Sabir.

**ÇOXCƏHƏTLİ** *sif.* Genişliyi, müxtəlifliyi ilə fərqlənən; çoxşaxəli, çoxtərəfli. *Çoxcəhətli fəaliyyət. – Bülbül Məmmədov 1931-ci ildə Vətənə qayıtdıqdan sonra çoxcəhətli yaradıcılıq işinə başladı.* (Qəzetlərdən).

**ÇOXCİLDLİ** *sif.* Çoxlu cilddən ibarət olan. *M.S.Ordubadinin çoxcildli seçilmiş əsərləri. Çoxcildli ədəbiyyat tarixi.*

**ÇOXÇALOVLU** *sif.* Bir neçə çalovu olan. *Çoxçalovlu ekskavator.*

**ÇOXÇARPAYILI** *sif.* Çoxlu çarpayı yerləşən. *Çoxçarpayılı xəstəxana.*

**ÇOXÇİÇƏKLİ** *sif. bot.* Çoxlu çiçəyi olan (bitkilər haqqında). *Çoxçiçəkli kol.*

**ÇOXDAN** *zərf* Xeyli zaman bundan əvvəl; əvvəldən, qabaqlardan. *Muğdusi çoxdan bilirdi ki, onun qonşuluğunda usta Cəfər adlı məharətli bənna və səliqəli gəcçəkən var.* C.Məmmədquluzadə. [Dürrə] *Qəzənfəri çoxdan sevirdi..* S.Vəliyev.

**ÇOXDANIŞAN** *sif.* Çox danışmağı sevən; naqqal, uzunçu. *Çoxdanışan adam.* – [Mikayılov] *Mərmər xanımın çoxdanışan* (z.) *olduğunu tamam yadından çıxarmışdı.* Y.Əzimzadə. // İs. mənasında. *Çoxdanışanın biridir.* – [Maya öz-özünə:] *Görünür,* [Salman] *bir az çoxdanışandır.* M.İbrahimov.

**ÇOXDANKI** *sif.* Çoxdan olmuş, qabaqlar baş vermiş. *Çoxdankı söhbət. Çoxdankı hadisə.*

**ÇOXDƏZGAHÇI** *sif.* Eyni zamanda bir neçə dəzgaha xidmət edən. *Çoxdəzgahçı fəhlə.* // İs. mənasında. *Çoxdəzgahçıların yarışı.*

**ÇOXDİLLİ** *sif.* 1. Müxtəlif dillərdə danışan adamlardan ibarət. *Çoxdilli respublika.*

2. Bir neçə dildə tərtib olunmuş. *Çoxdilli lüğət.*

**ÇOXDİŞCİKLİ** *sif.* 1. Çoxlu xırda dişləri olan. *Çoxdişcikli çarx.*

2. *zool.* Çoxlu dişciyi olan. *Çoxdişcikli balıq.*

**ÇOXDİŞLİ** *sif.* Çoxlu dişi olan. *Çoxdişli çarx.*

**ÇOXEVLİ** *sif. bot.* İkicinsiyyətli çiçəklərlə yanaşı bircinsiyyətli çiçəkləri də olan. *Qarabaşaq çoxevli bitkidir.*

**ÇOXƏRLİ** *sif.* Eyni zamanda bir neçə əri olan (bəzi tayfalarda nikah forması).

**ÇOXƏRLİLİK** *is.* 1. Arvadın eyni zamanda bir neçə əri olmasından ibarət nikah forması (bəzi tayfalarda); poliandriya.

2. Eyni zamanda bir neçə əri olma (bəzi tayfalarda).

**ÇOXƏSRLİ** *sif.* Çox əsr ərzində mövcud olan; çox əsr yaşayan, davam edən; qədim. *Bakının çoxəsrli tarixi. Çoxəsrli ədəbiyyat.*

**ÇOXƏSRLİK** *is.* Çox əsr ərzində mövcud olma, davam etmə, yaşama. *Ədəbiyyatımızın çoxəsrliliyi. Mədəniyyət abidələrinin çoxəsrliliyi.*

**ÇOXFAZALI** *sif. elektr.* Bir neçə və ya çox fazadan keçən. *Çoxfazalı enerji. Çoxfazalı elektrik axını.*

**ÇOXFİQURLU** *sif.* Bir neçə və ya çoxlu fiquru olan. *Sərgidə göstərilən çoxfiqurlu "Nümayiş" kompozisiyasına da bakılılar böyük maraqla baxırlar.* (Qəzetlərdən).

**ÇOXGÜCLÜ** *sif.* Bir neçə at qüvvəsində olan; qüvvətli (motor, maşın, mexanizm haqqında). *Çoxgüclü maşın. – Trestin mədənlərində 40-dan artıq çoxgüclü elektrik motoru azgüclü motorlarla əvəz edilmişdir.* (Qəzetlərdən).

**ÇOXGÜNLÜ** *sif.* Günlərlə davam edən. *Çoxgünlü səyahət. – Çoxgünlü kosmik uçuş müvəffəqiyyətlə başa çatdırıldı.*

**ÇOXHAKİMİYYƏTLİLİK** *is.* Eyni vəkaləti olan bir neçə hökumət orqanının eyni zamanda mövcud olması.

**ÇOXHECALI** *sif. dilç.* Bir neçə və ya çoxlu hecadan ibarət olan. *Çoxhecalı söz.*

**ÇOXHƏDLİ** *sif. riyaz.* Bir neçə təkhədlinin cəbri cəmindən ibarət olan. *Çoxhədli ifadə.*

**ÇOXHÜCEYRƏLİ** *sif. biol.* Çoxlu miqdarda hüceyrədən əmələ gəlmiş. *Çoxhüceyrəli orqanizm. Çoxhüceyrəli canlı.*

**ÇOXİLLİK** *sif.* 1. *bot.* Bir neçə və ya çox il yaşayan (bitki haqqında). *Çoxillik subtropik bitkilər. Çoxillik ot. – Çoxillik alaq texniki bitkilərin ən qatı düşmənidir.* (Qəzetlərdən).

2. Bir neçə il davam edən. *Çoxillik tədqiqat. Çoxillik zəhmət.*

**ÇOXİŞLƏNƏN** *sif.* Çox istifadə olunan, gündəlik ehtiyacı ödəmək üçün lazım olan, çox tələb olunan. *Sənaye məhsulunun və çoxişlənən malların .. illik istehsal planları artıqlamasilə yerinə yetirilmişdir.* (Qəzetlərdən).

**ÇOXQANADLILAR** *cəm zool.* Çoxlu qanadları olan cücülər sinfi.

**ÇOXQARINCIQLILAR** *cəm zool.* Bir neçə qarıncığı olan. *Çoxqarıncıqlılar sinfi.*

**ÇOXQATLI** *sif.* Bir neçə qatdan ibarət olan; çoxlaylı, çoxtəbəqəli. *Çoxqatlı karton.* // Çoxmərtəbəli.

**ÇOXLAMPALI** *sif. rad.* Bir neçə və ya çoxlu elektron lampası olan. *Çoxlampalı radioaparat. Çoxlampalı gücləndirici.*

**ÇOXLAŞMA** "Çoxlaşmaq"dan *f.sif.*

**ÇOXLAŞMAQ** bax **çoxalmaq**. *Ölkədə gündən-günə çoxlaşdılar; Hər əmələ, hər işə çulğaşdılar.* M.Ə.Sabir.

**ÇOXLAYLI** *sif.* Çoxqatlı, çoxtəbəqəli.

**ÇOXLU** *sif.* Sayca, miqdarca artıq; çox. *Çoxlu adam. Çoxlu vəsait. – Vağzalın qapısında çoxlu fayton dayanıb minik gözləyirdilər.* Ə.Haqverdiyev. *Salman kişi* [Aqilə] *çoxlu dəftər, rəngli qələm alacağını vəd etdi.* Mir Cəlal.

**ÇOXLUCA** *sif.* və *zərf* Lap çox, bolluca, çox-çox, bol-bol. *Ağac çoxluca meyvə gətirib. Çoxluca işim qalıb. – ..Gah vaxt olubdur ki, bəzilər bizdən soruşublar ki, belə bir vaxtda nə səbəbə siyasətdən, dumadan, hüquqdan, hürriyyətdən .. çoxluca bəhs etmirik.* C.Məmmədquluzadə. *Qoca xarrat qutuları; Rəndələyib vurdu sığal; Dedi: – Çiçək çox olanda; Arı verir çoxluca bal.* M.Dilbazi.

**ÇOXLUQ** *is.* 1. Bir şeyin çox olması; bolluq, firavanlıq. *Bazarda meyvənin çoxluğu. Məhsulun çoxluğu. Adamların çoxluğu.* – [Dilara] *evlərində heç vaxt həddindən artıq çoxluq və bəzək-düzək görməmişdi.* M.İbrahimov.

2. Sayca çox olan hissə; əksəriyyət (*azlıq* əksi). *Səs çoxluğu.* – [Uğur:] *Bizdə azlıq çoxluğa tabedir.* İ.Əfəndiyev.

**ÇOXMƏCHULLU** *sif. riyaz.* Bir neçə məchulu olan. *Çoxməchullu tənlik.*

**ÇOXMƏQSƏDLİ** *sif.* Bir neçə və ya çox məqsəd üçün istifadə edilən, çox məqsədi nəzərdə tutan. *Hər hansı orbital kosmik stansiya çoxməqsədli kosmik kompleksdir.* (Qəzetlərdən).

**ÇOXMƏNALI** *sif. dilç.* Çox mənası olan. *Çoxmənalı söz. "Baş" çoxmənalı sözdür.*

**ÇOXMƏRTƏBƏ(Lİ)** *sif.* Bir neçə və çoxlu mərtəbəsi olan. *Çoxmərtəbə ev. Çoxmərtəbəli bina.*

**ÇOXMİLLƏTLİ** *sif.* Çox millətlərdən, xalqlardan ibarət olan; çox millətləri, xalqları təmsil edən. *Çoxmillətli dövlət. Çoxmillətli respublika.* – [Aslan:] *Triyest çoxmillətli şəhərdir və buna görə də burada həyat daha maraqlı olmalıdır.* S.Vəliyev.

**ÇOXMİLYONLU** *sif.* Sayı, miqdarı, qiyməti milyonlarla hesablanan.

**ÇOXMİNLİ** *sif.* Sayı, miqdarı, qiyməti minlərlə hesablanan.

**ÇOXMOTORLU** *sif. tex.* Bir neçə motoru, mühərriki olan. *Çoxmotorlu təyyarə.*

**ÇOXMÖVZULU** *sif.* Bir neçə və ya çoxlu mövzusu olan. *Çoxmövzulu elmi tədqiqat planı.*

**ÇOXMÖVZULULUQ** *is*. Bir neçə və ya çoxlu mövzusu olma. *Çoxmövzululuqla mübarizə.* – [Elmi işlərin əlaqələndirilməsinin yarıtmaz olması] *nəticəsində elmi işdə çoxmövzululuq, paralelizm halları əmələ gəlmişdir.* (Qəzetlərdən).

**ÇOXNÖVÇÜ** *sif.* İdmanın çox növü ilə məşğul olan idmançı.

**ÇOXNÖVÇÜLÜK** *is. idm*. İdmanın bir neçə növündən ibarət yarış kompleksi. *Çoxnövçülükdə birinci yeri tutmaq. Çoxnövçülük üzrə yarışlar.*

**ÇOXNÖVLÜ** *sif.* Bir neçə və ya çoxlu növdən ibarət olan.

**ÇOXOTAQLI** *sif.* Bir neçə və ya çoxlu otaqdan ibarət olan. *Çoxotaqlı mənzil.* – *Çoxotaqlı, geniş artırmalı, rəngin pəncərəli, ikimərtəbə imarət daşdan tikilmişdi.* Çəmənzəminli.

**ÇOXPARTİYALI** *sif.* Bir neçə partiyanın nümayəndələrindən təşkil olunmuş. *Çoxpartiyalı hökumət.*

**ÇOXPİLLƏLİ** *sif.* Bir neçə hissədən, pillədən ibarət olan. *Çoxpilləli kosmik raket.* ◻ **Çoxpilləli seçki sistemi** – birbaşa seçkilərdən fərqli olaraq, seçicilərə deputat və ya başqa seçkiçilər seçmək üçün ancaq seçkiçilər seçmək hüququ verən seçki sistemi.

**ÇOXPLANLI** *sif.* Bir neçə sahəni, problemi nəzərdə tutan, qavrayan. *Çoxplanlı tədqiqat əsəri. – Müəllif bir yerdə "Səhər"i sadə olaraq çoxplanlı roman adlandırır.* (Qəzetlərdən).

**ÇOXRƏQƏMLİ** *sif.* Çoxlu rəqəmlərdən ibarət olan. *Çoxrəqəmli say.*

**ÇOXRƏNGLİ** *sif.* 1. Müxtəlif rəngli naxışları olan; ala-bəzək. *Çoxrəngli parça.*

2. *mətb*. Müxtəlif rənglərdə çap edən. *Çoxrəngli çap maşını.* // Bir neçə rəngdə çap olunmuş. *Çoxrəngli plakat. Çoxrəngli şəkillər.*

**ÇOXSAHƏLİ** *sif.* Bir neçə və ya çoxlu sahəsi olan, bir çox sahələri əhatə edən. // Bir çox sahəni əhatə edən. *Çoxsahəli fəaliyyət. – Mən şair olduğum üçün onun* [Mikayıl Mirzənin] *çoxsahəli fəaliyyətinin bir qanadından – poeziya qanadından danışmaq istəyirəm.* M.Araz.

**ÇOXSAYLI** *sif.* Sayı, miqdarı çox olan; çoxlu, çox. *Sara haqqındakı qədim əfsanə tədqiqatçıya çox şey deyir. Hətta həmin əfsanə çoxsaylı qız qalalarının da sirrini açmaq üçün bir vasitə ola bilər.* "Elm və həyat".

**ÇOXSƏNƏTLİ** *sif.* Bir neçə sənəti qavrayan. *Çoxsənətli artel.*

**ÇOXSƏSLİ** *sif. mus.* Çoxlu müxtəlif səslərdən ibarət olan, çoxlu müxtəlif səslərlə ifa olunan; polifonik. *Çoxsəsli xor. – Əgər müstəqil melodiyalar və yaxud ahəng təşkil edən köməkçi səslər ikidən çoxdursa, ona çoxsəsli musiqi deyilir.* "İbtidai musiqi nəzəriyyəsi".

**ÇOXSƏSLİLİK** *is. mus.* Vokal və ya instrumental əsərdə bir neçə səsin eyni zamanda birləşməsi; polifoniya.

**ÇOXSİMLİ** *sif.* Çoxlu simi olan. *Çoxsimli musiqi aləti.*

**ÇOXSÖZLÜ** *sif.* Bir neçə və ya çoxlu sözdən ibarət olan. *Çoxsözlü idiomatik ifadə.*

**ÇOXŞAXƏLİ** bax **çoxcəhətli**. [Rəssamın] *yaradıcılığı çoxşaxəlidir. O .. həm orijinal boyakar, həm də cizgi ustası kimi tanınır.* (Qəzetlərdən).

**ÇOXTELLİ** *sif.* Bir neçə və ya çox teli olan. *Çoxtelli kanat. Çoxtelli kabel.*

**ÇOXTƏBƏQƏLİ** *sif.* Bir neçə və ya çoxlu təbəqədən ibarət olan; çoxlaylı. *Çoxtəbəqəli neft yatağı.*

**ÇOXTƏKƏRLİ** *sif.* Bir neçə və ya çoxlu təkəri olan. *Çoxtəkərli parovoz.*

**ÇOXTƏRƏFLİ** *sif.* 1. *riyaz*. Bir neçə tərəfi olan; çoxüzlü. *Çoxtərəfli prizma.*

2. Bir neçə istiqaməti olan. *..Küçələr o qədər geniş və hərəkət o qədər çoxtərəflidir ki, maşınlar bir dəqiqə bir yerdə yığılıb durmalı olmur.* M.İbrahimov.

3. Bir məsələ ilə əlaqədar tərəflərin hamısı üçün məcburi olan. *Çoxtərəfli müqavilə. Çoxtərəfli saziş.*

4. Bax **çoxcəhətli**. *Çoxtərəfli yaradıcılıq.*

**ÇOXTİLLİ** *sif.* Bir neçə tili, tiyəsi olan. *Çoxtilli bıçaq. Çoxtilli burğu.*

**ÇOXTİRAJLI** *sif.* Böyük tirajla çap olunan, çıxan. *Klassiklərin çoxtirajlı əsərləri.*

**ÇOXTONLU** *sif.* Ağırlığı tonlarla olan. *Çoxtonlu yük.*

**ÇOXUŞAQLI** *sif.* Çoxlu uşağı olan. *Çoxuşaqlı ana. – Dövlətimiz çoxuşaqlı və tək analara külli miqdarda vəsait sərf edir..* (Qəzetlərdən). // Çoxlu uşaq olan. *Yalnız bizim ölkədə belə çoxuşaqlı ailə xoşbəxt yaşaya bilər!* (Qəzetlərdən).

**ÇOXÜZLÜ** b a x **çoxtərəfli** 1-ci mənada.

**ÇOXVAQONLU** *sif.* Çoxlu vaqondan tərtib olunmuş, çoxlu vaqon qoşulmuş. *Çoxvaqonlu qatar. – Başqa bir dəstə isə yenicə nəfəsini dərib, dayanmış çoxvaqonlu qatarın yükünü boşaldır.* (Qəzetlərdən).

**ÇOXVARİANTLI** *sif.* Çoxlu variantı olan; müxtəlif. *Eyni növ məhsulun istehsalı üçün vasitə, yol və formaların həddən artıq müxtəlifliyi təsərrüfatçılığın bütün proseslərini çoxvariantlı edir.* "Elm və həyat".

**ÇOXYAŞLI** *sif.* Yaşı çox olan; qoca. *Çoxyaşlı qadın. Çoxyaşlı ağac.*

**ÇOXYERLİ** *sif.* 1. Sərnişinlər üçün çoxlu yeri olan. *Çoxyerli avtobus. – Bakı ilə Moskva arasında "İl-12" markalı çoxyerli və sürətli sərnişin təyyarələri işləyir.* (Qəzetlərdən).

2. Çoxlu adamın yaşaması, oturması üçün olan; böyük. *Çoxyerli tamaşa salonu.* – [Ali] *məktəblərin yaraşıqlı binalara, çoxyerli və gözəl görkəmli tələbə yataqxanalarına böyük ehtiyacı var.* (Qəzetlərdən).

**ÇOXYEYƏN** *sif.* Yeməyində hədd bilməyən; qarınqulu, doymaz, yeyimcil. *Çoxyeyən adam.*

**ÇOLAQ** *sif.* Bir qıçı qısa və ya şikəst olan; axsaq, topal (bəzən qolu şikəst olanlara da deyilir). *Çolaq adam. – Molla da Teymuru hələ heç görməmiş imiş. Onun çolaq olduğunu da bilmirmiş.* "M.N.lətif.". *Dəcəl meymun, çolaq ayı, çəp keçi; Bir ulağa yoldaş oldu hər üçü.* A.Səhhət.

**ÇOLAQLAŞMA** "Çolaqlaşmaq"dan *f.sif.*

**ÇOLAQLAŞMAQ** *f.* Çolaq olmaq, ayağı şikəst olmaq.

**ÇOLAQLIQ** *is.* Çolaq adamın halı; axsaqlıq, topallıq. [Teymur] *elə zənn eləyir ki, Molla onun çolaqlığını üzünə vurmaq istəyir.* "M.N.lətif.".

**ÇOLMA-ÇOCUQ** *top.* 1. Övladlar, uşaqlar, oğul-uşaq. [Altunbay:] *Mən sən Qorxmazı bu gün öz çolma-çocuğundan ayırıb, bir itə dəyişəcəyəm.* C.Cabbarlı.

2.Uşaqlar, çocuqlar. [İlyas:] [Dayım] *qollarını geniş açaraq əvvəlcə bizi – çolma-çocuğun hamısını birdən qamarlayıb bağrına basdı..* Ə.Məmmədxanlı.

**ÇOLPA** *is.* 1. Toyuq, qartal; qırqovul və bəzi başqa quşların bir və ya ikiillik xoruzu. *Qoca qartal dağ başında qərar tutub, hər səhər; Uçurduğu çolpaları bu minvalla seyr edər.* S.Vurğun. *Xanpəri o gün işə çıxmayıb, iki çolpa kəsdirmiş, bir qazan zəfəranlı plov bişirmişdi.* Ə.Vəliyev.

2. Həmin xoruzun bütöv şəkildə qızardılmışı. *Tapdıq çolpanın ikinci budunu da dişinə çəkdi..* Ə.Əbülhəsən. [Arvad] *qazmağı bir boşqaba, çolpaları da ayrı boşqaba qoyub süfrəyə gətirdi.* Ə.Vəliyev.

3. *məc. zar.* Uşaq. [Qurban:] *Pah atonnan, ay Telli, belə getsə sənin bu çolpan böyük alim olacaq.* Ə.Məmmədxanlı.

**ÇOLPALANMA** "Çolpalanmaq"dan *f.sif.*

**ÇOLPALANMAQ** *f.* Çolpa yaşına çatmaq, böyüyüb çolpa olmaq; çolpalaşmaq. *Səhər qah-qah oxur şirin dililə; Çolpalanıb çıxır budağa kəklik.* Aşıq Rəcəb.

**ÇOLPALAŞMA** "Çolpalaşmaq"dan *f.sif.*

**ÇOLPALAŞMAQ** b a x **çolpalanmaq**. *Cücələr çolpalaşıb.*

**ÇOLPALI** *sif.* Çolpadan bişirilmiş, içərisində çolpa olan. *Xan həmişə Mirzənin çayını pürrəng, xörəyini çolpalı, döşəyini dördqat, mütəkkəsini qalın edərdi.* S.Rəhimov.

**ÇOLUQ-ÇOCUQ** b a x **çolma-çocuq**. *Kəndin kənarındakı böyük qoz ağacının altında qurulmuş mağarı çoluq-çocuq bürümüşdü.* Çəmənzəminli. *Çoluq-çocuq bir-birinə qarışmışdı.* S.Hüseyn.

**ÇOMAQ** *is.* Başı yumru ağac; dəyənək. *Çomaqla ilanı öldürmək. – Keçinin əcəli çatanda başını çobanın çomağına sürtər.* (Məsəl). *Kişi əlində çomaq; Sürür yüklü öküzü.* A.Səhhət.

**ÇOPUR** *is.* Çiçək xəstəliyindən üzdə qalan kələ-kötür, nahamarlıq, dəlmə-deşik. *Gülbadamın çopuru dərin olsaydı da, üzünü eyibli etməzdi, çünki onun böyük, ala, uzun-kirpikli gözləri üzünün tamam eybini örtürdü.* N.Nərimanov. // Sifətində belə kələ-kötür, dəlmə-deşik olan adam. [Kərbəlayı Nəbi:] *Dünyanın çopuru elə mənə qalmışdı.*

S.S.Axundov. // Sif. mənasında. [Bağban:] *Piltəbığ adamdı, bir az çopurdu; Üzünə baxanda bağrım qopurdu.* S.Rüstəm. *Rota komandiri gəlib çıxdı. Bu, boyca gödək, çopur, gursəsli Zaman idi.* Ə.Vəliyev.

**ÇOPURLAŞMA** "Çopurlaşmaq"dan *f.sif.*

**ÇOPURLAŞMAQ** *f.* Üzündə çopur əmələ gəlmək, çopur olmaq.

**ÇOPURLUQ** *is.* Üzü çopur adamın halı. [Gülbadamın] *uzaqdan çopurluğu nəinki məlum etməzdi, hətta bir az da üzünü gözəl göstərərdi.* N.Nərimanov. [Naşadın] *üzündə çopurluq əlaməti olduğu kimi, gözünün bir tayı da ləkəli idi.* S.Hüseyn.

**ÇOR** *is.* 1. Əsasən pambıqda, bəzən də başqa bitkilərdə xəstəlik. *Sahələr çor və pambıqqurduna qarşı bir neçə dəfə dərmanlanmışdır.* (Qəzetlərdən).

2. *məc.* Söyüş, qarğış mənasında. [Hafizə xanım:] *Çor xanım, zəhrimar xanım, itil çölə!* Ə.Haqverdiyev. [Telli:] *Çor, zəhrimar. Gəlirəm, gəlirəm.* Ü.Hacıbəyov.

**ÇOŞQA** *is.* [*rus.* чу́шка] *dan.* Donuz balası. *Yarım saat belə keçməmişdi ki,* [heyvandarlar] *bütöv qızardılmış çoşqanı gətirdilər.* M.Hüseyn.

**ÇOTUR** 1. *sif.* Kələ-kötür, nahamar.

2. *is.* Kələ-kötür, nahamar yer.

**ÇOVDAR** *is. bot.* Unundan qara çörək bişirilən taxıl bitkisi. *Çovdar unu. Çovdar əkini.*

**ÇOVDARLIQ** *is.* Çovdar əkilmiş yer, çovdar zəmisi.

**ÇOVĞUN** *is.* Küləkli qar və ya yağış; boran, qasırğa. *Çovğuna düşmək. – Bir saat çəkmədi ki, çovğun şiddətləndi, üfüq tutuldu, göy qaraldı, yer ağardı.* Mir Cəlal. *Yağış yağıb, külək əsib, çovğun qopmuşdu.* Ə.Əbülhəsən. // Çovğunlu hava. [Qəhrəman:] *Ötən qış çovğunda qəlbi bir ağacdan yıxılıbdır.* S.Rəhimov.

**ÇOVĞUNLAMA** "Çovğunlamaq"dan *f.sif.*

**ÇOVĞUNLAMAQ** *f.* Çovğun qalxmaq, çovğun başlamaq. *Hava çovğunladı.*

**ÇOVĞUNLU** *sif.* 1. Küləkli, qar və ya yağışlı; boranlı. *Çovğunlu gecə. – Rizvan belə qarlı və çovğunlu havada bir cüt öküzlə yola çıxmağa cürət etmədiyindən qonşusunun da öküzlərini aldı.* S.Hüseyn. *..Qış fəslinin çovğunlu günlərindən biri idi.* Y.Əzimzadə.

2. *məc.* Hadisələrlə dolu, həyəcanla dolu, gurultulu, kəşməkəşli. *Yaxşı bax, dünyanın başından keçən; Tufanlı, çovğunlu qərinələrə!* S.Vurğun.

**ÇOVUMA** 1. "Çovumaq"dan *f.sif.*

2. Bərk bir şeyə dəyib istiqamətini dəyişmə, hədəfdən yayınma (güllə haqqında).

**ÇOVUMAQ** *f.* 1. Cəld o tərəf-bu tərəfə getmək, qaçmaq, cummaq, cəld yönəlmək, atılmaq. *İrəli-geri çovumaq.*

2. Yanından ötüb keçmək (güllə haqqında). *Atlarımız qoşalaşanda ikimizin arasından bir güllə çovudu.* Ə.Vəliyev. // Bərk bir şeyə dəyib istiqamətini dəyişmək, hədəfdən yayınmaq (güllə haqqında).

**ÇOVUSTAN** b a x **çavıstan**. *Karvansara həyətinin lap ortasında dörd bir tərəfi açıq bir çovustan var idi, qaçqınlar burada gecələyirdi*(*lər*). Ə.Vəliyev. *Arayatılı kəndi o zaman Araza lap bitişik, qarğı çovustanlardan ibarət balaca bir "qışlaq" idi.* İ.Əfəndiyev.

**ÇOVUŞ** *is. tar.* 1. Keçmiş zamanlarda: fərmanları, qərarları, hökmləri uca səslə camaata elan edən şəxs.

2. Aşağırütbəli məmur. *Əvvəl, yəni iki il bundan əqdəm Xudayar bəy qlava yanında çovuş idi.* C.Məmmədquluzadə.

3. Keçmişdə: zəvvarları müşayiət edən, onların yola düşməsini və gəlməsini uca səslə camaata xəbər verən şəxs. *Sübh olcaq çavuşun münacatı kəndi əhatə eləyib, gah o məhəllədən səsi gəlir, gah bu məhəllədən.* C.Məmmədquluzadə.

**ÇOVUŞLUQ** *is.* Çovuş vəzifəsi. [Əmrah:] *O bir odunçudur, amma mənim atam kənddə bir neçə il kətxuda yanında çovuşluq eləyib.* Ə.Haqverdiyev.

**ÇÖDÜKOTU** *is. bot.* Yarpaqları xörəyə işlədilən, daşlıq yerlərdə bitən yabanı ot bitkisi.

**ÇÖHRƏ** *is.* Üz, surət, sima. *Bu qadının çöhrəsində bir məyusluq görünürdü.* S.S.Axundov. [Ayna] *gülər bir çöhrə ilə yoldaşlarına tərəf döndü.* Ə.Məmmədxanlı. // Obrazlı təşbehlərdə. *Ay yorğun və solğun çöhrəsi ilə buludların arasında gah batır, gah çıxır, parlaq və donuq bir ziya saçırdı.* Ə.Vəliyev. *Üfüqün ləkəsiz, təmiz çöhrəsi; Bir də sübh yeliydi onu oxudan.* Ə.Kürçaylı.

**ÇÖKDÜRMƏ** "Çökdürmək"dən *f.is.*

**ÇÖKDÜRMƏK** *f.* 1. Çökməsinə səbəb və ya vasitə olmaq. *Cənubdan əsən külək bacadan çıxan tüstünü getdikcə içəriyə çökdürürdü.* S.Rəhimov.

2. Oturtmaq, oturmağa məcbur etmək. *Dəvəni çökdürmək. – Padşah xacənin iki qolundan tutub dizi üstə çökdürdü.* Ə.Haqverdiyev.

**ÇÖKDÜRÜCÜ** *sif. xüs.* Çökdürən, çökməsinə kömək edən. *Çökdürücü maddə.*

**ÇÖKƏ**[1] *is. bot.* Ürəkşəkilli yarpaqları və ətirli sarı çiçəkləri olan ağac. *Çökə ağaclarının, qoruqlarda, tarlalarda biçilmiş təzə otların gözəl ətri .. bir-birinə qarışaraq obaya başqa bir rəng, başqa bir şəkil verirdi.* A.Şaiq.

**ÇÖKƏ**[2]**, ÇÖKƏBALIĞI** *is. zool.* Nərə balıqları ailəsindən qiymətli ov balığı.

**ÇÖKƏK** *is.* Yer səthində batıq yer, kiçik çala; oyuq. *İndi, bu arada çökəklərdə və bağların ara-bərəsində qalan tala qarlar da yavaş-yavaş əriyirdi.* S.Rəhimov. *Fişəng sönən kimi* [partizanlar] *cəld yüyürüb, özlərini çökəyə verdilər və kol-kosların arasında gizləndilər.* M.Hüseyn. // *sif.* Çökmüş, batmış, çuxurlaşmış. *Çökək yer.*

**ÇÖKƏKLİK** *is.* Çökək yer, çala yer; oyuq, çala. *Şırımlar açılarkən bəzi cərgələrdə çökəklik əmələ gəlir.* (Qəzetlərdən).

**ÇÖKƏLİK** *is.* Çoxlu çökə ağacları bitən yer.

**ÇÖKƏLMƏ** "Çökəlmək"dən *f.is.*

**ÇÖKƏLMƏK** *f.* Çökək əmələ gəlmək, içəri batmaq. [Sila] *gülərkən ovurdları çökəlir, bu vaxt gözə çox şirin görünürdü.* S.Vəliyev. [Mərcanın] *çökəlmiş* (f.sif.) *ovurdları dolub-boşalmağa, qırışmış dodaqları əsməyə başladı.* B.Bayramov.

**ÇÖKMƏ** "Çökmək"dən *f.is.* // *is.* Çökmüş, aşağa batmış yer; çala. *Şoran torpaqlara əsasən çökmələrdə təsadüf olunur.*

**ÇÖKMƏK** *f.* 1. Durduğu yerdən aşağı enmək, çuxura düşmək. *Binanın divarı çökmüşdür. Asfalt çökmüşdür.* // Aşağı enmək, dibinə oturmaq (mayenin içərisində olan toz, qum və s.).

2. Çömbəlib birdən-birə oturmaq. *Yerə çökmək. Dizi üstə çökmək. – İmamverdi baba kürsüyə çöküb, başıaşağı xeyli fikrə getdi.* S.S.Axundov. [Xan] *sərsəm kimi, ayaqları dolaşa-dolaşa divar dibinə qədər yeriyib oradakı döşəklərin üstünə çökdü.* M.Rzaquluzadə.

3. Çulğalamaq, qaplamaq, bürümək, yayılıb tutmaq, basmaq. *Dağlara, dərələrə duman çökdü.* // Məc. mənada. *Ürəyinə kədər çökmək. – İmran kişi aralığa çökmüş* (f.sif.) *ağır və cansıxan sükutun xeyli uzandığını görüb, idarə heyəti üzvlərinə ayrı-ayrılıqda müraciət elədi.* M.Hüseyn. *Çökdü gözlərinə bir qatı zülmət; Qırılıb yanına düşdü əlləri.* M.Rahim.

**ÇÖKÜK** *sif.* Çökəyə düşmüş, çökmüş, içəri batmış, çuxurlaşmış. *Çökük linza. Çökük güzgü. – Həyat* [Vasilini] *əzir, yorur, belini bükürdü. Lakin onun çökük sinəsində odlu, inadlı bir ürək döyünürdü.* İ.Qasımov.

**ÇÖKÜKLÜK** *is.* Çökük şeyin halı; çökük olma, içəriyə batma.

**ÇÖKÜNTÜ** *is.* Mayenin dibinə çökən şeylər; torta. *Çaxırın çöküntüsü. Ərimiş yağın çöküntüsü.*

**ÇÖL** *is.* 1. Qumluq, susuz düzənlik; səhra, bozqır, biyaban. *Ağcaqum çölü. Ərəbistan çölləri. – Nə mən Məcnun kimi çöllərdəyəm, bil; Nə sən Leyli kimi hicran xəstəsi.* S.Vurğun. // Meşəsiz düzənlik, sahə. *Malqara çöldə otlayır. Çöldə canavarlar ulayır. – Dolandım çöllər, səhralar; Bulaq üstə yarpız gördüm.* "Koroğlu".

2. Tarla. *Taxılı çöldən daşımaq. – Çöldə qızğın biçin gedirdi.* S.Rəhman.

3. *dan.* Bayır, dışarı, eşik, həyət. *Çölə çıxmaq. Çöldə gizlənmək. – Hamamın içində, içində və çölündə; Yay, yaz, qış, bahar isti, sərin var.* Ü.Hacıbəyov. *Şüşəbəndli otağın içərisi və çölü ağzınacan dolu idi.* S.Rəhimov. *Səni düşünürəm, yağır çöldə qar; Döyür pəncərəmi bir dəli ruzgar.* Ə.Cəmil.

◊ **Çöldə qalmaq** – evsiz-eşiksiz qalmaq. **Çöldə qoymaq** – evindən-eşiyindən qovmaq, məhrum etmək. **Çöllərə düşmək** – sərgərdan olmaq, ev-eşiyindən, yurdundan ayrı düşmək, yad yerləri dolaşmaq.

**çöl...** Mürəkkəb heyvan və bitki adlarının əvvəlində heyvan və ya bitkinin yabanı, vəhşi olduğunu bildirir; məs.: çölbuğdası, çöleşşəyi, çöllaləsi.

**ÇÖL-BAYIR** *is. dan.* Evdən dışarıda hər bir yer, ətraf yer. [Çimnaz] *çöldə-bayırda*

*geydiyi qara satin tumanını, nisbətən təzə şabalıdı qədək arxalığını çıxarıb boğçaya qoydu.* Ə.Əbülhəsən. *Doğur qış səhəri, susur çöl-bayır; Baharın özü də burda qışlayır.* N.Xəzri.

**ÇÖLBUĞDASI** *is. bot.* Yabanı halda bitən cır buğda növü.

**ÇÖLÇÜ** bax **çöllü** 1-ci mənada. [Hüseynəli xan:] *Mənim qızım oxumuş qızdır, sənə yaramaz, sən bir çölçü babasan, sənə kasıbfəndi qız gərək.* N.Vəzirov.

**ÇÖLDONUZU** *is. zool.* Vəhşi donuz.

**ÇÖLDOVŞANI** *is. zool.* Çöldə yaşayan dovşan.

**ÇÖLEŞŞƏYİ** *is. zool.* Vəhşi eşşək; gur.

**ÇÖLGÖYƏRÇİNİ** *is. zool.* Çöldə yaşayan vəhşi göyərçin.

**ÇÖLKEŞNİŞİ** *is. bot.* Yabanı halda bitən keşniş.

**ÇÖLKƏSƏYƏNİ** *is. zool.* Payız və qış yuxusu keçirən siçovula oxşar iri gəmirici.

**ÇÖLQARANQUŞU** *is. zool.* Yaşayış yerlərindən uzaqda, çöldə yaşayan qaranquş.

**ÇÖLQAZI** *is. zool.* Vəhşi qaz.

**ÇÖLLALƏSİ** *is. bot.* Yabanı halda bitən lalə.

**ÇÖLLƏMƏ** *zərf* Yolu qısaltmaq üçün çöldə düz yolla deyil, kəsə yolla. *Çölləmə getmək.*

**ÇÖLLÜ** *sif. köhn.* 1. Kəndli, kəndçi. *Xoş keçmədi il çöllüyə, dehqanə, nə borcum!* M.Ə.Sabir. *Kərbəlayı Xəlil dükanında oturub, çöllülərdən almış olduğu yağ barəsində düşünürdü.* T.Ş.Simurq.

2. *məc*. Geri qalmış, mədəniyyətsiz, savadsız mənasında. [Ələs bəy:] *Nə istəyirsən ey, nə? A çöllü!* Mir Cəlal.

**ÇÖLLÜK** *is.* bax **çöl** 1-ci mənada. [Atam:] *Ay dəli, çöllükdür, ürəyini sıxma! Bunun da bir nəşəsi var.* A.Şaiq.

**ÇÖLMƏ** *is.* Gildən qayrılmış qazan, qab; dopu. *Qız durdu ayağa, ocağı yandırdı, kəlləpaçanı saldı çölməyə.* (Nağıl). *Bozbaşdan doymaq istəyirsənsə, qonaqlarını tox yola salmaq istəyirsənsə, çölməyə çox ət sal.* C.Məmmədquluzadə.

**ÇÖLNANƏSİ** *is. bot.* Yabanı halda bitən nanə.

**ÇÖLNOXUDU** *is. bot.* Yabanı halda bitən noxud.

**ÇÖLÖRDƏYİ** *is. zool.* Vəhşi ördək.

**ÇÖLPİŞİYİ** *is. zool.* Vəhşi pişik.

**ÇÖLSİÇANI** *is. zool.* Çöldə yaşayan siçan növü.

**ÇÖLTƏRƏSİ** *is. bot.* Yazın əvvəllərində bitən, xörəyə qatılan ot bitkisi.

**ÇÖLTURŞƏNGİ** *is. bot.* Yabanı halda bitən turşəng.

**ÇÖLYOVŞANI** *is. bot.* Əsasən quru yamaclarda bitən yovşan.

**ÇÖMBƏLƏN[1], ÇÖMBƏLƏK** *zərf* Çömbəlmiş halda, çömbələrək, dizlərini yığaraq. *Çömbələn əyləşmək. – Pərişan çömbələk oturub, əlini arxın suyunda yudu və danışdı.* M.İbrahimov.

**ÇÖMBƏLƏN[2]** bax **dombalan** 2-ci mənada.

**ÇÖM(B)ƏLMƏ** 1. "Çöm(b)əlmək" *f.is.*

2. *zərf* bax **çömbələn**[1], **çömbələk**. *Çömbəlmə oturmaq.*

**ÇÖM(B)ƏLMƏK** *f.* Ayaqlarını dizlərindən qatlayıb pəncələri üstündə oturmaq. *Tülkü görcək yavaş-yavaş gəldi; Endirib baş, ədəblə çömbəldi.* M.Ə.Sabir. *Bir qədər də baxandan sonra kəndlilər gəlib çömbəlirlər tayanın kölgəsində.* C.Məmmədquluzadə. *Məstan bəy çömbəlib, darvazanın ağzında oturmuşdu.* B.Talıblı.

**ÇÖM(B)ƏLTMƏ** "Çöm(b)əltmək"dən *f.is.*

**ÇÖM(B)ƏLTMƏK** *icb.* Çöm(b)ələrək oturtmaq.

**ÇÖMÇƏ** *is. dan.* Uzun dəstəkli qaşıq; abgərdən. *Bircə baqqal çömçə ilə qazandan qatığı qovzayıb, kobud səsiylə deyirdi: – Qatığa gəl, qadan alım, qatığa gəl!* Çəmənzəminli. [Qoca] *əlində yonduğu ağac parçalarından qaşıq və çömçə qayırırdı.* Ə.Məmmədxanlı.

**ÇÖMÇƏBALIĞI** *is. zool.* Karp fəsiləsindən olub, adətən qurudulmuş halda yeyilən balıq.

**ÇÖMÇƏQUYRUQ** *is. zool.* Suda-quruda yaşayan heyvanların (qurbağanın, quruqurbağasının) quyruqlu sürfəsi. *Qurbağa sürfəsi yetişkən qurbağaya heç oxşamır və çömçəquyruq adlanır. Çömçəquyruğun bədəni oxlov şəkilli və quyruğu uzun olur.* "Zoologiya".

**ÇÖMÇƏLƏMƏ** "Çömçələmək"dən *f.sif.*

**ÇÖMÇƏLƏMƏK** *f.* Çömçə ilə götürmək və ya qarışdırmaq. *Dovğanı çömçələmək.*

**ÇÖNDƏRMƏ** "Çöndərmək"dən *f.sif.*

**ÇÖNDƏRMƏK** *f.* Döndərmək, çevirmək. *Xəbər gəldi ki, naçəlnik gəlir. Hamı üzünü çöndərdi Hacı Namazalının qapısına səmt və səs-səda lap kəsildi.* C.Məmmədquluzadə. *Qulu dolu ağzını çöndərib, ütük qaşlarını qovzuyub, .. nə deyəcək idisə, beş-altı yerdən onun sözünü kəsib çığırışdılar.* Çəmənzəminli.

**ÇÖNMƏ** "Çönmək"dən *f.sif.*

**ÇÖNMƏK** *f.* Dönmək. [Kiçikbəyim] *kolların şaqqıltısını eşidib çöndü. Məmməd bəy göründü.* Çəmənzəminli. *Sərvər birdən çönüb cəld qaçır.* Ü.Hacıbəyov.

**ÇÖP** *is.* 1. Taxta, ağac, saman və s. parçacığı. *Dişini çöplə təmizləmək. – Gəldiyev əlindəki kibrit çöpünü nəm çəkmiş zərflərin böyründən salır, bura-bura açırdı.* Mir Cəlal.

2. Bədənin bir yerinə batmış belə qırıntı, tikan və s. [Səkinə Güllüyə:] *Əlini mənə ver, çöpü çıxardım.* H.Seyidbəyli.

3. Boğazda (əsasən uşaqlarda) ilişib qalan sümük, tum qabığı və s. qırıntısı. *Uşağın çöpünü çıxarmaq.*

4. *bakt.* Çöp şəklində mikrob, basil. *Vərəm çöpü. – Müəyyən edilmişdir ki, efir yağının spirtli məhlulu .. bir sıra bakteriyaların bağırsaq çöplərini məhv edir.* "Elm və həyat". *Qarın yatalağı və qanlı ishal çöpləri 100-120 günədək salamat qalıb fəaliyyət göstərir.* "Sağlam məişət uğrunda".

◊ **Çöp atmaq** – eyni şeylər arasından bəxtəbəxt olaraq birini götürmək. **Əriyib çöpə dönmək** – xəstəlik və s. üzündən çox arıqlamaq, zəifləmək, üzülmək, qurumaq. *Uşaq lap çöpə dönübdür. – Bəli,* [adamlar] *canları ilə, yəni bədənləri ilə, yəni fədakarlıq eləyib, əriyib çöpə dönüblər.* C.Məmmədquluzadə.

**ÇÖPÇÜ** *is.* Keçmişdə: uşağın boğazında qalmış sümük və s.-ni çıxarmaqla məşğul olan arahəkimi. *Çöpçü uşağın boğazını və burnunu əlləşdirdi. Sonra başını bulayıb acıqlı-acıqlı Vəli kişiyə dedi: – Uşağın boğazı sümüklə, kömürlə doludur.* Ə.Vəliyev.

**ÇÖPÇÜLÜK** *is.* Keçmişdə: uşağın boğazından çöp çıxaran arahəkiminin peşəsi. [Yetər] *yeri düşəndə noxudla fala da baxırdı, çöpçülükdə də mahir idi.* Çəmənzəminli.

**ÇÖPLÜK** *sif.* Çoxlu çöp (alaq qırıntısı və s.) olan. *Payız əkini üçün saxlanan çöplük yerlərdə kotanlar işləyir, dəmirlərin parıltısı göyə qalxır, yay şumları qaldırılırdı.* S.Rəhimov.

**ÇÖPÜK** *sif.* 1. Yunun, kətanın arıtlanandan və daranandan sonra qalan hissəsi.

2. Kilkələnmiş yun.

**ÇÖR-ÇÖP** *top.* Alaq, ağac, ot və s. qırıntısı. *Üç qızın yığıb bir yerə qaladığı çör-çöpə Güldanə od vurdu.* Ə.Vəliyev. *Torpağın qış aratına qoyulması yerdə qalmış çör-çöpün çürüntüyə çevrilməsinə, torpağın qidalanmasına səbəb olur.*

**ÇÖRƏK** *is.* 1. Undan bişirilən qida məhsulu. *Buğda çörəyi. Ağ çörək* (buğda unundan bişirilən çörək). *Qara çörək* (qarabaşaq unundan bişirilən çörək). – *Mirzənin zamanında bazarda ucuzluq idi; yaxşı qoyun ətinin girvənkəsi dörd qəpik, yağın pudu dörd manat, çörəyin girvənkəsi iki qəpik idi.* Ə.Haqverdiyev. *Ortalığa bal, çörək, şit yağ və xırda boşqablarda südlüsıyıq qoyuldu.* Ə.Əbülhəsən.

2. *məc.* Ümumiyyətlə, yemək, xörək. *Çörəyimi yenicə yeyib qurtarmışdım ki, qonşumuz Hüseyn salamsız dərviş kimi qapını açıb içəri girdi.* Qantəmir. [Mərcan bəy:] *Ağız, Minnət!.. Çörək yeyibsən?* Ü.Hacıbəyov.

3. *məc. dan.* b a x **çörəkpulu**. [Durna:] *İstəyirdi, qardaşım kimi şəhərə gedib işləsin, bir az çörək qazansın..* C.Cabbarlı.

◊ **Çörək kəsmək** *məc.* – 1) dostluq etmək, yoldaşlıq etmək, dost olmaq; 2) çörək yemək, yemək yemək. [Qoca:] *Əxilər məclisində səninlə bir süfrədə çörək kəsmişik ki, bala!* Ə.Məmmədxanlı. **Çörəyi dizinin üstündə** – nankor, yaxşılıq itirən adam haqqında.

**ÇÖRƏKAĞACI** *is.* 1. *bot.* Nişasta ilə zəngin meyvələri bişirilmiş və ya qızardılmış halda yeyilən tropik ağac. *Tropik meşələrə məxsus nadir bitkilərdən biri də çörəkağacıdır.* M.İbrahimov.

2. *məc. dan.* Yaşama mənbəyi, dolanacaq vasitəsi, gəlir mənbəyi. *Çörəkağacı olan skripkası* [Məzluma] *yenə səadət gətirəcəkdir.* S.Vəliyev. [Mədən müdiri:] *Axı mədən sizin* [fəhlələrin] *çörəkağacıdır.* M.Hüseyn.

**ÇÖRƏKBİŞİRƏN** *sif.* Çörək bişirməklə məşğul olan. *Çörəkbişirən fəhlə.*

**ÇÖRƏKBİŞİRMƏ** *is.* Çörək bişirmə işi və bu işlə məşğul olma. *Çörəkbişirmə sənayesi. – Əminik ki, həmin təşkilatlar Binəqədidəki çörəkbişirmə sexinin əsaslı təmiri qayğısına qalacaq.* (Qəzetlərdən).

**ÇÖRƏKÇİ** *is.* 1. Çörək dükanı.

2. Çörək dükanında işləyən adam; çörəksatan.

3. Keçmişdə: çörək bişirib satmaqla məşğul olan adam. // Keçmişdə: başqaları üçün muzdla çörək bişirən. *Axşamçağı Xavərnisənin üç bacısı, qardaşı, Kərbəlayı Xəlilin arvadı və qonşularından Tükəzban xala, çörəkçi Gülnaz cəm olub, hazırlığa başlamışdılar.* T.Ş.Simurq.

**ÇÖRƏKÇİLİK** *is.* 1. Yeyinti sənayesinin çörəkbişirmə sahəsi.

2. Keçmişdə: çörək bişirib satmaqla məşğul olan adamın işi, peşəsi. *Əhalinin bir qismi də xırda ticarətlə – halvaçılıq, çörəkçilik, həlimaşıçılıq, baqqallıq, bəzzazlıqla məşğul olardı.* H.Sarabski.

**ÇÖRƏKDAŞIYAN** *sif.* Çörək daşımaq üçün istifadə olunan. *Çörəkdaşıyan maşın.*

**ÇÖRƏKXANA** *is.* Çörək bişirilən müəssisə. *Kənd çörəkxanası. – Bəşirli gülümsündü: – ..bir çörəkxana düzəltsələr yaxşı olar.* Ə.Vəliyev.

**ÇÖRƏKİTİRƏN** *sif.* Başqasının zəhmətini, yaxşılığını unudan, çörəyi dizinin üstündə olan; nankor. [Səməd:] *Mən çörəkitirən adam deyiləm. Atanın yaxşılığına qarşı sizi darda qoymaram.* C.Cabbarlı. [Əsgər bəy:] *Bayaqdan Ataşı qınayırıq ki, nacinsdir, çörəkitirəndir*. Ə.Vəliyev.

**ÇÖRƏKQABI** *is.* Çörək qoymaq üçün qab. [Nisə xalanın] *dalınca da əlində çörəkqabı və boşqablar olan Əkbər gəldi.* S.Rəhman.

**ÇÖRƏKLƏMƏ** "Çörəkləmək"dən *f.sif.*

**ÇÖRƏKLƏMƏK** *f.* Çörək verib bəsləmək, saxlamaq, yedirib-içirmək. [2-ci əcinnə:] *Özünü vurubsan səfehliyə, xanımın xoşuna gəlib, səni çörəkləyib saxlayır.* Ə.Haqverdiyev.

**ÇÖRƏKLİ** *sif.* 1. Firavan yaşayan, çörəyi bol olan; varlı, bərəkətli. [Nəcəfalı Şahmara:] *Hümmət bu kəndi çörəkli eləyib, bala!* B.Bayramov. // *məc.* Səxavətli, əliaçıq, qonaqpərvər. [Səlimə:] *Allah səni həmişə qonaqlı, çörəkli eləsin.* Ə.Haqverdiyev.

2. *dan.* Qazanclı, gəlirli. *Çörəkli iş.*

**ÇÖRƏKPULU** *is. dan.* Gündəlik dolanmaq, yaşamaq üçün cüzi pul, vəsait. [Ağa:] *İldə beş-on şahı qulbeçələrinə çörəkpulu aparıram.* Ə.Haqverdiyev. [Hacı Sultan:] *Yavaş-yavaş alver edib, çörəkpulusunu qazanırdı.* S.Hüseyn.

**ÇÖRƏKSATAN** b a x **çörəkçi** 2-ci mənada.

**ÇÖRƏKVERƏN** *sif. dan.* Əliaçıq, səxavətli, comərd. *Mir Cümə qapısıaçıq, çörəkverən bir adamdı.* P.Makulu.

**ÇÖRƏKVERMƏZ** *sif.* Simic, xəsis. *Çörəkverməzlər də tez tanınıbdır; Dönük xislətiylə, əqidəsiylə.* Ə.Kürçaylı.

**ÇÖRƏKYAPAN** *sif.* Çörək yapmaqla məşğul olan; çörəkbişirən, çörəkçi. [Arvadlardan] *biri çörəkyapandı.* Ə.Əbülhəsən.

**ÇÖTKƏ** *is.* [*rus.*] *köhn.* Dördbucaqlı çərçivədə eninə taxılmış millərə keçirilən aşıqlardan ibarət sadə hesablama aləti; sayğac. *Xozeyin dinməz-söyləməz çötkəni götürüb, çaqçuq hesab elədi.* S.M.Qənizadə. [Hesabdar] *çötkə dənələrini tərpətdi, dənələr millərdə fırlanaraq şıq-şıq şıqqıldadı.* S.Rəhimov. ◻ **Çötkəyə vurmaq (salmaq)** – çötkədə hesablamaq. [Əsgər:] *Rəsul oxumur, atamız da gündə beş yol dəftəri çıxardıb qoyur qabağına, vurur çötkəyə.* N.Vəzirov. *Əgər durub yaxşı hesab eləsək və çötkəyə salıb tərəziyə vursaq, görərik ki, müsəlmanlar on bir ayın müddətində yeyib-içməyə xərclədiklərindən çox artıq bircə ramazan ayında yeyib-içməyə xərcləyirlər.* C.Məmmədquluzadə.

**ÇÖVKƏN** *is.* Keçmişdə at üstündə ucu əyri çomaqla oynanılan top-top oyunu. *Çövkən oynamaq. Çövkən oyunu.* // Həmin oyunda istifadə olunan iri top. *Koroğlu der: olan qalsın; Dağı-daşı talan qalsın; Çövkən alıb çalan qalsın; Meydandadır başlarımız.* "Koroğlu".

**ÇÖVKİRMƏ** "Çövkirmək"dən *f.is.*

**ÇÖVKİRMƏK** *f. köhn.* Çevirmək, döndərmək. *Havanın ələfiyyata lazım olmağın belə bəyan etmək olur: bir göyərən otu istəkanı çövkirib onun altında saxlayanda ot quruyub tələf olur.* "Əkinçi".

**ÇÖYRÜKMƏ** "Çöyrükmək"dən *f.is.*

**ÇÖYRÜKMƏK** *f. köhn.* Çevrilmək. *Qulu gecə sabaha kimi istidən yata bilməyib, o yan-bu yana çöyrükdü və hər çöyrükəndə də üstündən bir yorğan sürüşüb düşürdü.* Çəmənzəminli.

**ÇÖZ** *is. anat.* Bağırsaqları qarın boşluğunun dal divarına bağlayan periton büküşü; mezenterium.

**ÇÖZƏLƏMƏK** *f.* Sarınmış, düyünlənmiş şeyləri tədricən açmaq. ◻ **Yumağı çözələmək** – düyünü çözələmək.

**ÇÖZƏNƏK** *is.* Tör-töküntü.

**ÇÖZMƏK** *f.* Təhlil etmək, şərh etmək, izah etmək, aydınlaşdırmaq, tədqiq etmək.

**ÇÖZÜM** *is.* Şərh, tədqiqat.

**ÇUBUQ** *is.* 1. Elastik, yarpaqsız, nazik, düz budaq, şüy. *Çubuqla yun döymək. Söyüd çubuğu. – Mirzağa əlində tutub gəzdirmək üçün bağçadan bir çubuq kəsmişdi.* S.Hüseyn. *Kərim baba .. iki barmaq qalınlığında yaş çubuğu yonurdu.* A.Şaiq.

2. Nazik metal mil. *Dəmir çubuq.*

3. Tənbəki çəkmək üçün bir ucu ağızlıq, digər ucunda isə tənbəki tökməyə məxsus yeri olan içiboş nazik ağac parçasından ibarət cihaz; qəlyan. *Çıxartdı* [Məmmədhəsən əmi] *çubuğunu və kisəsini və çubuğu doldurub başladı çəkməyə.* C.Məmmədquluzadə.

4. *məc.* Arıq, nazik, incə mənasında. *Çubuq qız.* – [Aslan bəy:] [Aydəmir] *19 yaşında çubuq uşaq*(*dır*). C.Cabbarlı. *Daha Ələmdar qutudakı üzüyü öz çubuq barmağına keçirib, bilərziyi dəyənək qoluna bağlayıb, həmayili də sinəsindən asmayacaqdı ki.* S.Rəhimov.

**ÇUBUQBAŞI** *is.* Çubuğun (3-cü mənada) içərisinə tənbəki qoyulub yandırılan hissəsi.

**ÇUBUQCUQ** "Çubuq"dan *kiç. Nar çubuqcuğu.*

**ÇUBUQLAMA** "Çubuqlamaq"dan *f.sif.*

**ÇUBUQLAMAQ** *f.* Çubuqla vurmaq, çubuqla döyəcləmək, çubuqla çırpmaq. *Xalçanı çubuqlamaq.* // Çubuqla döymək, çubuqla vurmaq. *Kəli çubuqlamaq.*

**ÇUBUQLANMA** "Çubuqlanmaq"dan *f.sif.*

**ÇUBUQLANMAQ** *məch.* Çubuqla vurulmaq, çubuqla döyəclənmək, çubuqla çırpılmaq. // Çubuqla döyülmək, çubuqla vurulmaq.

**ÇUBUQLAŞMA** "Çubuqlaşmaq"dan *f.sif.*

**ÇUBUQLAŞMAQ** *qarş.* Çubuqla bir-birini vurmaq, çubuqla vuruşmaq.

**ÇUBUQVARİ** *sif.* Çubuq kimi nazik və düz.

**ÇUDU** *is.* Lay-lay xəmirdən ətli və ya qozlu qoğal.

**ÇUĞLAMAQ** *f.* Xəbərçilik etmək.

**ÇUĞUL** *is.* Xəbərçi, şeytanlıq edən adam. *Qaçaq Nəbi gün yağlanmamışdan durur, həndəvərə göz gəzdirir. Həcərin "Ay Nəbi, niyə yatmırsan?" sorğusuna qarşı, "çuğul ölməyib" deyə cavab verirdi.* S.Rəhimov. *Gəzir könülləri söz yaza-yaza; Çuğul xəbər verir bunu knyaza.* S.Vurğun.

**ÇUĞULÇU** b a x **cuğul**.

**ÇUĞULLAMA** "Çuğullamaq"dan *f.sif.*

**ÇUĞULLAMAQ** *f.* Xəbər vermək, xəbərçilik etmək, şeytanlamaq. [Əsli:] *Kərəm, atam səni Süleyman paşaya çuğullayıb.* "Əsli və Kərəm". [Nabat:] *Ağa, vallah, yalan deyir, nahaq yerdən gəlib məni sənə çuğullayır.* S.S.Axundov.

**ÇUĞULLUQ, ÇUĞULÇULUQ** *is.* Xəbərçilik, şeytanlıq. [Bayram:] *İndi sən* [Pərzad] *istərsənmi ki, mən özümü bədnam edib, çuğulçuluq adını üstümə götürüm?* M.F.Axundzadə.

**ÇUĞUNDUR** *is. bot.* Qırmızı və ya ağrəngli iri yumruları və iri yarpaqları olan bostan bitkisi. [Rüstəm] *bir neçə yaxşı şumlanmış, hətta çuğundur və soğan əkilmiş sahəyə baxdı.* M.İbrahimov. // Həmin bitkinin qırmızı və ağrəngli yoğun yeməli kökü. [Molla:] *İndi bir pud çuğundur aparıram.* "M.N.lətif.". *Quru ot, yonca, çuğundur, silos inəklərin xoşladığı yemdir.* Ə.Vəliyev. ◻ **Qənd (şəkər) çuğunduru** – kökündən qənd alınan çuğundur növü.

**ÇUĞUNDURÇU** *is.* Çuğundurçuluq mütəxəssisi.

**ÇUĞUNDURÇULUQ** *is.* Kənd təsərrüfatının çuğundur əkib-becərməklə məşğul olan sahəsi.

**ÇUĞUNDUROTU** *is. bot.* Üstü tüklə örtülü bir, iki və ya çoxillik ot bitkisi.

**ÇUĞUNDURYIĞAN, ÇUĞUNDURÇIXARAN** *is.* Çuğunduru yerdən çıxarıb yığan maşın. *Yeni markalı çuğunduryığan* (*çuğundurçıxaran*). // Sif. mənasında. *Çuğunduryığan maşın.*

**ÇUXA** *is.* Qafqazlıların üstdən geyilən, beli büzməli, uzun, kişi milli geyimi. *Çərkəzi çuxa* (döşündə vəznələri olan çuxa növü). – [Usta Ağabala] *dolahadola neçə arşın qurşağını açıb tökdü və sonra çuxa, arxalıq, canarxalıq – hamısını birdən çıxarıb tappıltı ilə saldı keçənin üstünə.* Çəmənzəminli. *Kəndli 45-50 yaşında, göy çuxa geymiş, ucaboylu, sarı və bozsaqqallı bir kişi idi.* T.Ş.Simurq.

**ÇUXALI** *sif.* Əynində çuxa olan, çuxa geymiş. *Çuxalı qoca.* – *Qara çuxalı bir düşmən süvarisi özünü yetirərək komandanı yaraladı.* H.Nəzərli.

**ÇUXALIQ** *is.* Çuxa tikmək üçün parça. *Qəmər şalı öz əri üçün çuxalıq toxumuşdu.* Ə.Vəliyev. // sif. *Çuxa üçün yararlı. Çuxalıq mahud.*

**ÇUXUR** *is.* 1. Yer səthindən aşağı çökmüş, oyulmuş yer; oyuq, çala. *Məmməd bir böyük və dərin çuxur qazıb, eşşəyin leşini ora saldı, üstünü torpaqladı.* E.Sultanov. *Çəpərlərdən çıxan tikan kolları oynaya-oynaya gəlib yol çuxurlarında bənd alır.* Mir Cəlal. // Sif. mənasında. *Dünyada hər iş öz qaydasınca gedir, suyu tökəndə çuxur yerə axır..* C.Məmmədquluzadə. *Xanlar cəld geriyə döndü. Çuxur bir yer tapıb, daldalanmaq istədi.* M.Hüseyn.

2. Bədənin bəzi yerlərində (xüsusən üzdə, yanaqda) əmələ gələn xırda çökək yer; batıq. [Sila] *gülərkən yenə ordu batır, sifətində çuxur əmələ gəlirdi.* Ə.Vəliyev. [Gülşənin] *hər iki yanağında kiçik çuxurlar əmələ gəldi.* Q.İlkin.

3. Dərin nimçə, dərin qab. [Aftil Hacı Əhmədə:] *Budur, sən hər gün xoruzbeçə yeyirsən, mənim uşaqlarım bir çuxur bulama tapa bilmir.* C.Cabbarlı.

◊ **Gözləri çuxura düşmək** – b a x **gözləri quyuya düşmək** (**"göz"**də).

**ÇUXURCUQ** *kiç.* Kiçik çuxur, balaca çuxur.

**ÇUXURLANMA, ÇUXURLAŞMA** "Çuxurlanmaq", "çuxurlaşmaq"dan *f.is.*

**ÇUXURLANMAQ, ÇUXURLAŞMAQ** *f.* Çuxur əmələ gəlmək, dərinləşmək, çuxura düşmək. *Ələsgər gördü ki, bu gözəlin zənəxdanının böyründə bir cüt həbəşi xalı var, gözlər güləndə üz çuxurlanıb, xallar gizlənir.* "Aşıq Ələsgər". [Şah] *isə düz gedir, bu rəngi qaçmış, gözləri çuxurlanmış* (f.sif.) *insanların üzünə belə baxmırdı.* M.İbrahimov.

**ÇUXURLUQ** *is.* Çuxur yer, çalalıq. *Çuxurluqda gizlənmək.*

**ÇUQUN** *is.* [*rus.*] 1. Polad almaq və ya tökmə məmulatı hazırlamaq üçün işlədilən karbonla dəmirin xəlitəsi. *Çuqun əritmək.*

2. Həmin metaldan qab. *Çuqunda xörək bişirmək.* // Bu metaldan hazırlanmış. *Çuqun qazan.* – *İmran kişi havanın belə gözlənilmədən soyumasına fikir vermir və bu səbəbdən də çuqun peçini qoydurmurdu.* M.Hüseyn. *Küçələrdə sıra ilə yerə basdırılmış çuqun dirəklərin başında ağ kürələr parlayırdı.* Ə.Sadıq.

**ÇUQUNƏRİTMƏ, ÇUQUNTÖKMƏ** *is.* Çuqun əridilən, tökülən (zavod, sex və s.). *Çuqunəritmə sənayesi.* – *Çuquntökmə sexini yenidən qurmaq üçün hazırlıq aparılır.*

**ÇUL** *is.* 1. Üstündə oturmaq və ya soyuqdan qorunmaq üçün atın və bəzi başqa heyvanların dalına salınan qıldan və ya yundan toxunma qalın örtük. *Şirməmməd öküzləri rahatladı, çullarını alıb qabaqlarına yem tökdü.* E.Sultanov. [Nisə xala:] *Yəhərləmək lazım deyil, çulu aşır üstünə.* Qantəmir.

2. *dan.* Geyim, paltar mənasında (istehza ilə).

◊ **Çul kimi yerə sərilmək** – yerə dəymək, birdən bərk yıxılmaq. *Bayram qoşalüləni hərləyib qırma barıtı bəyin qarnına doldurur. Bəy çul kimi yerə sərilir.* Ə.Vəliyev. **Çulunu sudan çıxarmaq** – birtəhər dolanmaq, işin içindən çıxmaq. [Şirzad Yarməmmədə:] *Deyirəm, qorxaqsan, birtəhər sürünüb çulunu sudan çıxarmaq istəyirsən.* M.İbrahimov. *Turaclılar demişkən* [Qurban] *oxuyub qurtarmadı, bəlkə süründü, ölüm-zülüm çulunu sudan çıxartdı.* Ə.Vəliyev.

**ÇUL-ÇUXA** *top. isteh. köhn.* Geyim, paltar (adətən dəbdən çıxmış paltar haqqında). *Yamayardım babamın çul-çuxasın.* M.Ə.Sabir. [Balaş Sevilə:] *..Kişi üçün də bu dal otaqda yer sal, tez yatsın, çul-çuxası ilə həyətəzada çıxar, biabır olarıq.* C.Cabbarlı.

**ÇULĞA(LA)MA** "Çulğa(la)maq"dan *f.sif.*

**ÇULĞA(LA)MAQ** b a x **qaplamaq**. *Səhərdir, günəşin rəngi sapsarı; Sarılıq çulğamış ağ buludları.* S.Vurğun. *Silah səsləri sahili çulğaladı.* M.Hüseyn.

**ÇULĞA(LA)NMA** "Çulğa(la)nmaq"dan *f.sif.*

**ÇULĞA(LA)NMAQ** *f.* Bürünmək, qapanmaq, dürtülmək. *Qaranlığa çulğalanmış* (f.sif.) *bir çox evlərin sahibləri hələ tarladan qayıtmamışdılar.* T.Ş.Simurq. *Çulğalanıb çən və dumanla bayır; Mürgüləyir dağ, dərə, orman, çayır.* A.Şaiq.

**ÇULLAMA** "Çullamaq"dan *f.sif.*

**ÇULLAMAQ** *f.* 1. Dalına çul qoymaq (heyvanın). *Atı çullamaq. – Molla öküzünü çullayır, ağzına da bir yüyən vurub meydana gəlir.* "M.N.lətif.". [Nəbi:] *And içirəm, sənə məxmər çullaram; Bozat, qurtar məni, aman günüdür.* "Qaçaq Nəbi".

2. *dan. zar.* Üst-üstə çoxlu paltar geyindirmək.

**ÇULLANMA** "Çullanmaq"dan *f.sif.*

**ÇULLANMAQ** 1. *məch.* Dalına çul qoyulmaq (heyvanın).

2. *dan. qayıd. zar.* Üst-üstə çoxlu paltar geymək, qalın geymək. *Nə olub belə çullanıbsan?*

**ÇULLATMA** "Çullatmaq"dan *f.sif.*

**ÇULLATMAQ** *icb.* Dalına çul qoydurmaq (heyvanın). *Atı çullatmaq.* – [Koroğlu Həmzəyə:] *Qış olanda məxmər çullat! At igidin qardaşıdı.* "Koroğlu".

**ÇULLU** *sif.* Çulu olan, çullanmış, dalına çul qoyulmuş. *Çullu at.*

◊ **Ağzına çullu dovşan yerləşmir (sığmır)** – b a x **ağız**[1].

**ÇUMUR, ÇUMUR-ÇUMUR** *is.* Kiçik qum təpəciyindəki qumu hərə barmaqla öz tərəfinə çəkməkdən ibarət uşaq oyunu. *Çumur* (*çumur-çumur*) *oynamaq.*

**ÇUR!** Uşaq oyunlarında: qadağan olunmuş bir şeyə toxunmaqdan və ya başqa işdən saqındırmaq üçün işlədilən nida, söz. *Çur səndən, cığallamaq məndən.* (Ata. sözü).

**ÇURSAF** *is.* "Çur" deyilmədiyi halda oyunda istifadə olunan şeyləri götürmək istərkən işlədilən söz. *"Çursaf" deyib topu götürmək. – Bir keçəl bir uşağa aşıqlarını uduzub, çursaf eləyib aşıqları götürdü.* (Nağıl).

**ÇUST** *is.* Dabansız, yüngül ayaqqabı. *Çust geymək. – Yağış yağanda sel gətirən köhnə başmaqları, çustları, çəkmələri, çarıqları* [Şeyx Şaban] *yığıb, qalıba vurub, yamayıb ucuz qiymətilə – cütünü altı şahıdan, bir abbasıdan satardı.* Ə.Haqverdiyev. [Ağasəfərin] *ayağında isə qara meşin çust vardı.* Ə.Əbülhəsən.

**ÇUŞKA** *is.* 1. Külçə xammal. □ **Çuğun çuşkası**.

2. *məc.* Xam adam (jarqonizm).

**ÇUVAL** *is.* 1. Böyük kisə, xaral. *Bayram oldu, heç bilmirəm neyləyim: Bizim evdə dolu çuval da yoxdur.* M.P.Vaqif. *Qızlar sabah tezdən .. pambıqları yığacaq, çuval və xarallara doldurub təhvil verəcəklərdi.* Ə.Vəliyev.

2. Saylardan sonra gələrək çuval tutan miqdarı bildirir. *Yarım çuval buğda.* – [Qurban Telliyə:] *Hər ağac altından üç-dörd çuval əzik-üzük alma yığmışıq.* Ə.Məmmədxanlı.

**çuval-çuval** *sif.* Çuvallar dolusu; çuvallarla; çoxlu. [Xortdan:] *Bir yanda çuval-çuval buğda qoyulub, bir yanda yağ, pendir..* Ə.Haqverdiyev. *Əllaflar çuval-çuval arpa, buğda və saman alıb, arabalara doldurur, eşşəklərə yükləyirdilər.* A.Şaiq.

**ÇUVALDUZ** *is.* İti ucu yastı və əyri iri qıyıq. *İynəni özünə, çuvalduzu yoldaşına.* (Ata. sözü). *Axşam namazından, şam yeməyindən sonra, əlində çuvalduz çarığını köşələyən Salman kişi ayaq səsi eşitdi.* Mir Cəlal.

**ÇUVAŞ** *is.* Çuvaş Respublikasının əsas əhalisini təşkil edən türkdilli xalq və bu xalqa mənsub adam.

**ÇUVAŞCA** *sif.* və *zərf* Çuvaş dilində. *Çuvaşca danışmaq. Çuvaşca-rusca lüğət.*

**ÇÜN** [*fars.*] *klas. köhn.* b a x **çünki**. [Münəccim dedi:] *Yuxunun mənasını tapsa o qoca tapar, çün belə yuxuların mənasını tapmaq bizim işimiz deyil.* (Nağıl). *Dezdemona dəsmalı arayıb tapmayanda, ziyadə təşvişə düşmüşdü və hər kəsdən onun sorağını edirdi. Çün dəsmalı çox zərif və üstü gözəl çiçəklər ilə tikilmiş bir dəsmal idi.* F.Köçərli.

**ÇÜNKİ** *bağl.* [*fars.*] Ona görə ki, bundan dolayı, bu səbəbdən. [Vaqif] *ehtiyat edirdi, çünki bu görüş yanlış şayiələr doğura bilərdi.* Çəmənzəminli. [Əsgər:] *Yəqin ki, getməz, çünki o, bəy qızıdır.* Ü.Hacıbəyov. // Bir halda ki, madam ki. *Çünki oldun dəyirmançı; Çağır gəlsin dən, Koroğlu!* "Koroğlu".

**ÇÜRÜK** *sif.* 1. Çürüyüb xarab olmuş; çürümüş. *Çürük taxta. Çürük meyvə.* – [Balaş:] *Artıq bu həqiqətdir ki, qadınsız cəmiyyət çürük bir ağac kimidir*. C.Cabbarlı. [Sona:] *Öz məhəbbətinə dönük çıxan .. adamı çürük diş kimi kökündən qoparıb ataram.* B.Bayramov.

2. *məc*. Sağlam bir təmələ, dəlilə əsaslanmayan; etibarsız. *Çürük nəzəriyyə. Çürük fikirlər. – Əsrlərdən bəri avam xalqın iliyinə qədər yerləşmiş çürük əqidələr dəxi puç olub getdi.* Ü.Hacıbəyov. // *məc*. Köhnəlmiş, zəmanəyə uyğun olmayan, vaxtı keçmiş. *Çürük adətlər.* // *məc*. Boş, mənasız, lüzumsuz. [Səlim:] *Sizin kimi ziyalı bir adam bu kimi çürük və mənasız şeylərlə məşğul olarsa, o zaman avam və fanatik müsəlmanları nə haqla qınaya bilərik?* S.Hüseyn.

◊ **Çürüyünü çıxar(t)maq** – bir şeyi həddindən artıq təkrarlayaraq bıqdırmaq. [Bibixanım Fərruxa:] *O qədər çürüyünü çıxardırsan ki, sonra day yerini almaz.* B.Bayramov.

**ÇÜRÜKÇÜ** *is.* Bir şeyi həddindən artıq təkrar etməklə bıqdıran, təngə gətirən adam. [Satıcı:] *Qardaşoğlu, de görüm alansan, ya çürükçüsən!* Mir Cəlal.

**ÇÜRÜKÇÜLÜK** *is.* Çürükçü adamın xasiyyəti; çürükçü olma.

◊ **Çürükçülük eləmək** – bir şey haqqında həddən artıq danışmaq, təkrar etmək, çürüyünü çıxarmaq. *Bəsdir çürükçülük elədin.* – [Zalxa Namaza:] *Yaxşı, bəsdir, keçən işi indi çürükçülük eləyib danışmaq sənə qalıbdır?* M.F.Axundzadə.

**ÇÜRÜKLÜK** *is*. Çürük şeyin halı; çürük olma. *Taxtanın çürüklüyü*.

**ÇÜRÜMƏ** "Çürümək"dən *f.sif.*

**ÇÜRÜMƏK** *f.* 1. Mikroorqanizmlərin təsiri altında pozulub xarab olmaq. *Taxta çürüdü. Meyvələr yağışdan çürümüşdür.* – [Qərənfilin] *də yarı canı qalıb südün yanında ki, südü bişirmədim, çürüyəcək.* Ə.Vəliyev. *Ayaq üstündə çürümüş* (f.sif.) *iri ağacın yıxılmasına bənzər küt bir xırıltı eşidildi.* B.Bayramov.

2. *məc*. Pozulub dağılmağa başlamaq; pozulmaq, məhv olmaq, məhvə məhkum olmaq. *Çünki İran əks-inqilabını himayə edən çar hökuməti öz içərisindən çürüməkdədir*. M.S.Ordubadi. *"Molla Nəsrəddin" çürümüş, köhnə, yaramaz, üfunət saçan həyat və ictimai əlaqələrin hərtərəfli və öldürücü tənqidçisidir.* M.İbrahimov. // *məc*. Məhv olmaq, yıpranmaq. *Dərdli Kərəm bu yollarda çürüyə; Yolçunu yolundan eylər bu gəlin!* "Əsli və Kərəm". *Heç kəs istəməz ki, oğlu qazamatda illərlə çürüsün.* N.Nərimanov.

**ÇÜRÜNTÜ** *is.* Çürümüş şeylər. *Xəzəl çürüntüsü. – Meşədən həmişəki ürəkaçan ətirli rayihə əvəzinə rütubətli çürüntü qoxusu gəlirdi*. M.Rzaquluzadə. *Torpağın qış aratına qoyulması yerdə qalmış çör-çöpün çürüntüyə çevrilməsinə, torpağın qidalanmasına səbəb olur.*

**ÇÜRÜNTÜLÜ** *sif.* Tərkibində çürüntü olan, çürüntü ilə qarışmış. *Çürüntülü torpaq.*

**ÇÜRÜTMƏ** "Çürütmək"dən *f.sif.*

**ÇÜRÜTMƏK** *f.* 1. Çürüməsinə səbəb və ya vasitə olmaq, çürüməsi üçün şərait yaratmaq. *Xəzəli torpağa qarışdırıb çürütmək. – Gölməçə suların rəngi sapsarı; Xəstəlik çürüdür ağaclıqları.* S.Vurğun. [Göyçək] *ayranı çürüdüb şor elədi*. Ə.Vəliyev.

2. *məc*. Əzab və əziyyət içərisində məhv etmək. *Südabəyə elə gəlirdi ki, Kərimxanın cəlladları, Firidunu məhbəsdə çürüdən* (f.sif.) *qatillər qarşısında oturmuşdur.* M.İbrahimov. *..Azadlıq üçün minlər və on minlərlə inqilabçılar sürgünlərdə, həbsxanalarda canlarını çürüdüblər.* Ə.Sadıq.

**ÇÜY** *is.* Mil, çiv (təkərdə).

# Dd

**D** Azərbaycan əlifbasının beşinci hərfi. Bax **de**[1].

**DA**[1] **(DƏ)** 1. Danışan şəxsin məsələyə münasibətini, hiss və həyəcanını bildirməyə xidmət edən və çox vaxt yerindən və məna çalarından asılı olub müəyyən intonasiya ilə deyilərək aşağıdakı vəzifələrdə işlədilən ədat. 1) Əmr bildirən fellərdən sonra gələrək təkid, israr, bəzən də əmr bildirir. *Gəl də! Tez ol da! Yaz da! Gətir də!* – [Qasım kişi:] *..İndi mən bu mətləbləri başa düşmürəm. Sən ki oxumusan, gəl cavab ver də!* C.Məmmədquluzadə. [Hacı Əhməd:] *Atam, qoyun kişi sözünü desin də, arvad oldu, nə oldu, söz danışır axı.* C.Cabbarlı. [Hüseynqulu Yunisə:] *Gəl çıx da, demirsən bəs işimiz var, planımız var?* Mir Cəlal; 2) saylardan sonra topluluq, ümumiləşdirmə mənasında işlənir. *İkisi də bir-birindən gözəldir. – Mən çöndüm Dilbərə tərəf. Mənim Dilbərim bu dörd nəfər xanımların dördündən də gözəl idi.* C.Məmmədquluzadə. // Təkrar olunan sözün ikincisinə qoşularaq fərqləndirmə, ayırma məqamında işlənir. *Gah çəkic vurdu əlim, gah da qələm tutdu əlim; Coşdu könlümdə müqəddəs əməlim.* S.Rüstəm. *Zeynalov gah sol, gah da sağ əlinin barmaqlarına baxa-baxa danışığını nə cür başlayacağı haqqında düşünürdü.* Ə.Vəliyev; 3) özündən əvvəl gələn sözün mənasını gücləndirir, nəzərə çarpdırır və ayırır. *Sənin də bu işlərə həvəsin var! Bizim də fikrimizə qulaq as. Başqaları ilə də hesablaşmaq lazımdır. – Nədənsə geri qayıtmaq da istəməyirdim.* S.Hüseyn. [Mirzə Səməndər:] *A kişi, sən də çox qozqurtma ha!* C.Cabbarlı. *Yazmağına sözüm yox, amma bir bizə də yazsın da!* Mir Cəlal. // Özündən əvvəl gələn sözə müxtəlif ekspressiv-emosional rənglər verir. *Nə qədər də gözəldir! Necə də oxuyur! Belə də xoş səs olar?* // Qoşatərkibli ədatlar əmələ gətirir. [İbrahim xan:] *Yenə də şikayət? Gəl inan ki, sən; Nə qədər mən sağam, kef görəcəksən.* S.Vurğun. [Gültəkin:] *Fəqət qoyun, son dəfə olaraq bütün xoşbəxt günlərimi keçirdiyim bu qaranlıq məhzun evciyəzi bir də doyunca görüm.* C.Cabbarlı. *Cahangir cavab vermədi, o qəsdən bir az da qaşqabağını sallayaraq dayandı.* S.Rəhman; 4) intonasiyadan asılı olaraq, danışanın bir şeyə müsbət və ya mənfi münasibətini bildirir. *Elə, arvad yalan demir ki, doğru deyir də!* C.Məmmədquluzadə. [Tərlan xanım:] *Yaxşıdır ki, qapımızın artıq tikəsi ilə böyüyüb, bəslənib. Burnundan gəlsin o... Belədir də!* Mir Cəlal. [Yusif:] *Elə adamı da yandıran budur da.* Ə.Vəliyev; 5) narazılıq, məmnuniyyətsizlik bildirir. *Qoymursunuz bir yerdə oturaq da.* – [Hacı Mehdi:] *A kişi, dəli əlinə düşmüşəm də!* Ə.Haqverdiyev. [Əlisa:] *Canım, ölmədik, altmışı da adladıq, arvadların əlinə düşdük də!* S.Rəhimov. [Kərəmov Zinyətə:] *Hə, məni hədələyirsən? Qoymurlar da, qoymurlar ki, sakit oturub iş görək.* S.Rəhman. // İntonasiyadan asılı olaraq, bəzən kinayə, yaxud könülsüz razılıq məqamında işlənir. [Hacı Əhməd:] *Neynək, kəndimiz tərəqqi eləsin də.* C.Cabbarlı. *Biz nə deyirik ki, gəlsin də...* S.Rəhman. [Gəldiyev Rübabəyə:] *Demək, özünü məndən ağıllı bilirsən də!* Mir Cəlal. // Razılıq, məmnunluq məqamında. [Mirzə Qoşunəli:] *Ha, belə ha!.. Allah oğlunu saxlasın, əvvəldən de də!* Ə.Haqverdiyev. // Arzu bildirir. *O günlər getsin də, gəlməsin. Yaxşı olsun da, xərcin zərəri yoxdur;* 6) təəssüf, peşmanlıq, ya etiraf məqamında işlənir. *Bir işdi oldu da...* M.Hüseyn; 7) bir işi, hadisəni təsdiq məqamında işlənir. [Qoca kişi:] *Başına dolanım, ay həkim, bu uşağın heç azarı-bezarı yoxdu, dəli-zad da deyil ha.* C.Məmmədquluzadə. *Bu xalq da sənin kimi vətəndaşdır da!* C.Cabbarlı. *Ay Merac, sənin qaydandır da..* Ə.Vəliyev. [Gülər:] *Mən bayaqdan onu deyirəm də..* S.Rəhman; 8) qoşulduğu sözə istehza, kinayə, saymazlıq, laqeydlik çaları verir. *Boş şeydir də. Səsdir də. Adamdı da! – Deyəsən, canavar əli görsədiblər, qorxur da.* Mir Cəlal; 9) yəqinlik, yaxud haqqında söhbət gedən şeyin mütləq olacağını, baş verməli olduğunu bildirir. *Söz verib, gələcək də. Mühəndisliyə həvəsi çoxdur, olacaq da. Bilsəydi, deyərdi də. – Seçicilər* [Barxudardan] *adına layiq iş tələb etməyə, hünər gözləməyə haqlıdırlar və bunu edəcəklər də.* Mir Cəlal. [Musa:]

*Söz vermişəm də, gələcəyəm də... Mən camaatdan uzaqlaşmıram.* S.Rəhman; 10) bəzən haqqında söhbət gedən məsələyə qarşı danışanın şübhə, ya inamsızlıq hissini ifadə edir. *Deyirsən də... Görərik də... – Axı, yəni deyirsən, cəmi-məxluqat öz başına yaranıb da?* C.Məmmədquluzadə; 11) "doğrudan", "həqiqətən" sözlərindən sonra gələrək, onların mənasını gücləndirir, dəqiqləşdirir. [Gülüş:] *Ax, Sevil, sən doğrudan da yazıqsan, hər şeyə Balaşın yoxsulluq gözü ilə baxırsan.* C.Cabbarlı. *..Rübabənin gözü özündə idi, çünki Rübabə bu məktəbə görməyə, görünməyə, axtarmağa yox, doğrudan da oxumağa gəlmişdi.* Mir Cəlal. *Doğrudan da vaxt yoxdur.* S.Rəhman; 12) *dan.* bəzən "ki" bağlayıcısından əvvəl gəlib, haqqında söhbət gedən şeyin, hadisənin, halın davamlılığını, bütün tədbir və çalışmalara baxmayaraq, bir şeyin baş tutmadığını, əmələ gəlmədiyini bildirir. *İstilər düşmür də ki, düşmür. İstəmir də ki, istəmir.* – [Xanım:] *Ay Gülöyşə, yazıq Böyükkişi lap hər şeydən cinlənir, nə olsun, bilmirəm, sağalmır da ki, sağalmır.* S.Rəhimov; 13) "əlbəttə" mənasında (görülən, yaxud görüləcək bir işə haqq qazandırır). *Belə eləsən, gəlməz də. Çağırsaydın, gələrdi də. – Çubuq dolduran birisi..* [qatırçının] *sualına cavab verdi: – Necə olacaq, necə hanı? Top atan elə olar da.* Mir Cəlal; 14) "heç" mənasında (feillərdən sonra gələrək onların mənasını daha da nəzərə çarpdırır). *Ancaq Rübabə bilsəydi,* [Ağca xanım] *Gəldiyevin arvadıdır və uşaq onun oğulluğudur, heç dalınca düşməz, bir kəlmə danışmazdı da.* Mir Cəlal. [Qürbət:] *Yusif! Sənin bu pərdəli sözünə yoxam da!* Ə.Vəliyev. [Kərəmov:] *..Sən öl, bu cavanlara söz başa salmaq olmur da...* S.Rəhman; 15) məgər, heç (sual məqamında işlənilir). *Bu qədər də yağıntı olar? – Dəftərxanaçı soruşdu: – Niyə duruxdun? – Ac da qarovul olarmı?* Mir Cəlal; 16) "üstəlik", "hələ bir", "dəxi", "bir də" mənasında işlənir. *Günahkar özü olduğu halda, danışır da. Danışmağa dili də var. – Bu cür axmaq .. yaltaqdan şadlanır və yalançıya ənam da verir.* M.F.Axundzadə. [Hacı Baxşəli:] *Ədə, hələ utanmırsan da danışırsan?* C.Məmmədquluzadə. [Zalxa Zinyətə:] *Buna bax ha, hələ forsuna da dəyir.* S.Rəhman.

2. Həmcins üzvlü cümlələrdə həmcins üzvləri, mürəkkəb tabeli cümlələrdə isə baş cümlə ilə budaq cümlələri bir-birinə bağlayan və aşağıdakı mənaları ifadə edən bağlayıcı. 1) "dəxi", "həmçinin", "o cümlədən" mənasında. *O da bizimlə getmişdi. Oğlunu da özü ilə bərabər apardı. Onu mən də çox axtardım. Onun da adı siyahıda var. Mən də getməyə hazıram. O da bu fikirdədir. – Bir ay bundan qabaq övrətimi və uşaqlarımı da götürüb Ağdaşdan Bakıya köçürmüşəm.* C.Məmmədquluzadə. *Atabala da o dövrün bir nümayəndəsi idi.* A.Şaiq. *Burada ucuz qiymətə şərab da tapmaq olurdu.* Ə.Əbülhəsən. // "Habelə", "dəxi" mənasında. *Bizim küçədə də toy-bayram olar.* (Məsəl). *..Nəcəf Yəhya oğlunun da məktubu zarafatnan yazılıb..* C.Məmmədquluzadə. [Zeynal] *vaxtı ilə əmanət kassasında birikdirdiyi və topladığı yeddi-səkkiz yüz manatı da xərcləmişdi.* S.Hüseyn. [Səlim:] *Mən səni bir doğru qız zənn edərdim, səndə aldatmaq da varmış?!* H.Cavid; 2) həmcins üzvləri bir-birinə bağlayır. *O da, yoldaşı da gəlməlidir. Mənim də, sənin də, onun da iştirakı vacibdir. Qızlar da, oğlanlar da bədən tərbiyəsi ilə məşğul olmalıdır!* – [Sənəm:] *Ah! Qoca olandan sonra heç nə! Ağrım onun özünə də, dövlətinə də!* Ü.Hacıbəyov. *Zoya bunları* [söyüşləri] *danışmaqdan, Gəldiyev də eşitməkdən ləzzət alır. Od da öz işindədir, şiş də.* Mir Cəlal. [Həbib bəy:] *..Yaxşı oxu, adam ol, bizim də üzümüz ağ olsun, ananın da.* S.Rəhman; 3) şərt şəklində olan sözü başqa bir sözlə bağladığı vaxt ikincisinin birinciyə qarşı olduğunu bildirir. *Əlləşsə də, faydası yoxdur. Çox yüyürdüsə də, çata bilmədi. O bilməsə də, sən bilməlisən. – Cümlə cahan yatsa da, biz yatmarıq..* M.Ə.Sabir. *Qızılı udsa da qara torpaqlar; Yenə qiymətini özündə saxlar.* S.Vurğun. *Əhməd operasiya edilmişdisə də, gülləni çiynindən çıxara bilməmişdilər.* Ə.Vəliyev. *Qədirin bu hərəkətini hamı bilsə və pisləsə də, o əl çəkmirdi.* Mir Cəlal. // Bəzən həmin formada olan sözə güzəşt mənası verir. *Görsəm də, tanımaram. Ölsəm də, məqsədimə çatmalıyam;* 4) bəzi

feli bağlamalardan sonra gələrək, "və" bağlayıcısı, bəzən isə təkid mənasında işlənir. *Ona tez dəyib də qayıt. Alıb da evə dön. Gəlib də getdi. O məni görüb də görməməzliyə vurdu. Çıxıb da get. – Yanan qəlbinə sanki su saçdılar; O yerdən alıb da məni qaçdılar.* M.Ə.Sabir. *Məni bir baxışda eşq oduna saldı da getdi.* C.Cabbarlı; 5) o biri tərəfdən, bundan əlavə, hələ (əvvəlki cümlədə təsvir olunan hadisəyə və s.-yə başqa bir hadisənin və s.-nin əlavə olunduğunu bildirir). *..Bacım Fatma da hamilə idi və doğmağına bir neçə gün qalanda əri İsmayıl bəy də gəldi İrəvana.* C.Məmmədquluzadə. *Əhməd bəy bundan da diltəng olub, həmişəlik xanənişin olub, altı-yeddi sənə evindən çıxmadı.* Ə.Haqverdiyev. [Zərifə:] *Girdim imtahana... Qəşəng də geyinmişdim..* S.Rəhman. // Cavabən, cavab olaraq, öz növbəsində, öz tərəfindən (fikri əvvəlki cümlədə söylənilənlərə bağlamaq üçün işlənir). *Mən də dönüb belə dedim. Onlar da yavaş-yavaş dinməyə başladılar. – Qurbanəli bəy də yerindən qalxıb, stəkanını götürüb vurdu xanımın stəkanına.* C.Məmmədquluzadə; 6) "hətta", "belə" mənasında. *İclasa qocalar və yaşlı qadınlar da gəlmişdi. Elə sözlər danışırsan ki, bişmiş toyuğun da gülməyi gəlir. Kölgədə oturmuşduq, amma burada da nəfəs almaq mümkün deyildi.* – [Novruzəli:] *Heç nəçərnik də bu kağızı mənim əlimdən ala bilməz.* C.Məmmədquluzadə. *Hacı Kamyab kimi kişinin atasına da od vurmaq olar?!* Ə.Haqverdiyev. *Adamın pisini-yaxşısını bir həftədə yox, lap bir saatda da tanımaq olar.* M.İbrahimov; 7) "heç olmasa", "barı" mənasında. *Bunca oxudun, yorul da bari; Bir dəfə burax bu zəhrimari.* M.Ə.Sabir; 8) "həm" mənasında. *Qələm də aldım, dəftər də. O da, bu da. Mən də, yoldaşlarım da eyni fikirdəyik.* – [Əzrayıl bəy:] *Qılıncımın dalı da kəsirdi, qabağı da.* Ə.Haqverdiyev. *Bu yay Rübabə də, Vahid də diplomlarını almışdılar.* Mir Cəlal. *Hava da, torpaq da, gül də, bahar da; Soyuq da, şaxta da, boran da, qar da; Tapır mənasını insanla ancaq.* M.Dilbazi.

**DA²** "Daha" sözünün canlı dildə işlənən ixtisar forması olub "a" uzadılaraq deyilir. *Da sənə nə deyim. – Padşah Əhmədi-Çekkaşdan xəbər aldı: – Da nəyin qaldı? Əhmədi-Çekkaş dedi: – Da sağlığın!* (Nağıl).

**DABAQ** *is. bayt.* Qaramal, davar və donuzlarda yoluxucu xəstəlik. *Dabaq xəstəliyinə qarşı mübarizə.* ☐ **Dabaq olmaq** – dabaq xəstəliyinə tutulmaq. *İnək dabaq oldu.*

**DABAN** *is.* 1. İnsan və heyvan ayağının dal hissəsi. *Çox gəzməkdən dabanlarım sızıldayır.*

2. Ayağa geyilən şeylərin arxa hissəsi. *Corabın dabanını yamamaq. – Qərənfil xala corabların ikisinin də dabanını toxuyub kəsdi.* Ə.Vəliyev. // Ayaqqabı altının arxa tərəfindəki möhkəm və qalın hissə. *Çəkmənin dabanı ilə başımdan vurub papağımı saldı yerə.* C.Məmmədquluzadə. [Dilənçi] *ayağına dabanları yatırılıb əyilmiş bir kişi başmağı geymişdi.* Ə.Sadıq.

3. *dan*. Bir daban bərabərində uzunluq. *Gülsənəm arvad Cəmilin .. bir ildə azı bir daban uzandığını görüb sevindi.* M.Hüseyn.

4. *dan*. Dəfə, kərə. *Üç daban getmək.*

5. B a x **ayaq¹** 9-cu mənada. *Tüfəngi dabana çəkmək. Dabanda saxlamaq. – Sənsə cəbhədəsən belə bir gündə; Tüfəngin dabanda bir döyüşçüsən.* S.Vurğun.

6. *məh*. Dəyirmanın üst daşını yuxarı qaldırmaq üçün dirəklərdən düzəldilən qurğu.

7. B a x **dabana**. *Qapının dabanı.* – [Xortdan:] *Uşağı olmayan qadınlar gedib qarınlarını ağanın qapısının dabanına sürtərdilər.* Ə.Haqverdiyev. *..Üçüncü dəfə qapını taqqataqla döydülər, az qaldı dabanı çıxsın.* M.İbrahimov.

◊ **Daban almaq** – qaçmaq, götürülmək, yüyürüb getmək. *Xoruzoğlu kağızı cibinə qoyub daban almış və enişlərdə xoruz kimi qanadlanmışdı.* S.Rəhimov. *Daban aldı müxalifin qoşunu.* M.Rahim. *Uşaq: – Sağ olun, – deyib, əlindəki kağıza baxa-baxa daban almaq istəyəndə müavin çağırdı.* Mir Cəlal. **Daban döymək** – çox gəzmək. *Gündüz axşama kimi hər kəs ona iş buyurduğuna və o da daban döydüyünə görə o qədər yorulardı ki, yerə uzanmaqla yuxuya getməyi bir olardı.* S.Rəhimov. **Daban qırmadan** – dayanmadan. *Onlar daban qırmadan qaçırdılar.* "Qaçaq Nəbi". **Dabanına daş dəymək** – yubanmaq, gecikmək, ləngimək. **Dabanına daş dəymiş** – bəduğur, uğursuz. **Dabanına tüpürmək** –

b a x **daban almaq**. *Çuğul qarı .. dabanına tüpürüb özünü birbaşa Soltan Mahmuda yetirdi.* (Nağıl). *Salman bəy dedi: – Dabanımıza tüpürək, hər nə ola, ola.* N.Vəzirov.

**daban-dabana** *zərf* Tamamilə. *Daban-dabana zidd. – Bu şərq küləyilə daban-dabana; Bu uzun yollarda qovub səhəri; Böyük Şərq şerinin dühası gəlir.* Şəhriyar.

**DABANA** *is.* Qapının, pəncərənin, darvazanın alt böyründə olub, çərçivəyə girən və yuvasında dönə bilən çıxıntı. *Qapının dabanası. – Tövlə qapısının ağac dabanası cırıldadı..* S.Rəhimov.

**DABANBALIĞI** *is. zool.* Çəkikimilər fəsiləsindən qırmızı üzgəcli şirin su balığı.

**DABANBASA** b a x **dabanbasma**. *Sənəm, səsəmi gəldin? Dabanbasamı gəldin?* A.Şaiq.

**DABANBASARAQ** b a x **dabanbasma**. *Kimi evə yüyürürdü, kimi də dabanbasaraq küçəyə qaçırdı.* S.Şamilov.

**DABANBASMA** *zərf* 1. Sürətlə, qaçaraq, tələsik.

2. Addım-addım izləyərək. *Kürkçüoğlu onu göz açmağa qoymayıb, dabanbasma onu paytaxtadək təqib edirdi.* M.F.Axundzadə.

**DABANCIQ** *is.* Kiçik daban, incə daban.

**DABANDAŞI** *is.* Əldə, dabanda bərkləşmiş çirki sürtüb çıxarmaq üçün süngər kimi məsaməli yüngül daş; pemza, süngərdaşı.

**DABANIÇATLAQ** *sif. dan.* Pinti, natəmiz. *Yerə kəlağayı sərib, qızı onun üstündə gəzdirərdilər ki, görsünlər, kəlağayı qırışmır ki.. Qırışmış olsa, dabanıçatlaqdır, – deyə almazdılar.* R.Əfəndiyev.

**DABANIQALXIQ** *sif. dan.* Gəzəyən.

**DABANIQARA** b a x **qaradaban**.

**DABANLAMA** "Dabanlamaq"dan *f.is.*

**DABANLAMAQ** *f.* Ardınca düşmək, addım-addım izləmək, təqib etmək. *Yüzlərlə adam bir-birini dabanlayırdı.* S.Rəhimov.

**DABANLI** *sif.* 1. Dabanı olan. *Dabanlı tufli.*

2. *məc. dan.* Qılçaları qüvvətli. *Dabanlı adam.*

**DABANSIZ** *sif.* Dabanı olmayan. *Dabansız ayaqqabı.*

**DABBAĞ** *is.* [*ər.*] Heyvan dərilərini aşılama vasitəsilə gönə və meşinə çevirmək sənəti ilə məşğul olan usta. *Dabbağ sevdiyi dərini yerdən-yerə vurar.* (Ata. sözü). □ **Dabbağ etmək** – dərini aşılama vasitəsilə gön və ya meşinə çevirmək.

◊ **Dabbağda gönünə bələd olmaq (gönünü tanımaq)** – bir adamın keçmişinə və hər cür gizli işlərinə yaxşı bələd olmaq, keçmişini, iç-üzünü bilmək. [Əbdül:] *Mənim gözüm kor deyil, mən Kərimin dabbağda gönünü tanıyıram.* Ə.Haqverdiyev. [Xanlar:] *Mən* [Abuzər bəyin] *dabbağda gönünə bələdəm.* M.Hüseyn.

**DABBAĞXANA** *is.* [*ər.* dəbbağ və *fars.* ...xanə] Xam dərilərdən aşılama yolu ilə gön və meşin hazırlanan karxana, emalatxana. *Qadın dabbağxana dərəsi məhəlləsinə dönərkən Fəxrəddin onu səslədi..* M.S.Ordubadi. *Sərdar Təbrizin məşhur dabbağxanaları yerləşən səmtə doğru yönəldi.* P.Makulu.

◊ **Dabbağxanada gönünü tanımaq (gönünə bələd olmaq)** – b a x **dabbağda gönünə bələd olmaq** (**"dabbağ"**da). *Mən onun dabbağxanada gönünü tanıyıram.* A.Şaiq.

**DABBAĞLIQ** 1. *is.* Xam dəriləri gön və meşin halına salma sənəti. *Dabbağlıq etmək.*

2. *sif.* Gön və meşin olmağa yarayan. *Dabbağlıq dəri.*

**DAD**[1] *is.* 1. Yeyilən və ya içilən şeyin acılıq, şirinlik, turşluq, duzluluq, şitlik və s. cəhətdən hiss olunan xüsusiyyəti; tam. *Kür suyunun dadı nə acıdır, nə şordur, nə turşdur, .. nə iylidir.* C.Məmmədquluzadə. □ **Dad orqanı (üzvü)** *anat.* – dilin səthində olan və dadı müəyyənləşdirməyə xidmət edən sinir ucları. **Dadına baxmaq** – 1) yeyilən və ya içilən şeyin dadını bilmək üçün ondan bir az yemək, ya içmək; 2) az yemək.

2. *məc.* Ləzzət, nəşə. *Ad mənim, yar özgənin; Neylərəm mən bu dadı.* Sarı Aşıq. [Qacar:] *Deyirlər şirindir busənin dadı; O da kor bəxtimə qismət olmadı.* S.Vurğun. □ **Dad almaq** – ləzzət almaq. *Bu yeməkdən heç bir dad almadım. – Ol şuxə ki can olurdu Fərhad; Şirin dodağından aldı yüz dad.* Xətayi. *Qoy başını sinəsinə, bir dad al; Qoy babalın boynuma, get, arvad al.* M.Ə.Sabir. **Dad vermək** – ləzzət vermək, nəşə vermək, xoşa gəlmək. *Bahar nə xoş gəlir, ruha dad verir; Xəyala, duyğuya qol-qanad verir.* S.Vurğun. *Yeni xəbərlər, xüsusən müsamirə qızlara dad verirdi.* Ə.Vəliyev. **Dada gətirmək** – dadlı

etmək, ləzzətli etmək; dadlandırmaq. **Dadı damaqda qalmaq, dadı damaqdan getməmək** – unudulmayacaq qədər ləzzətli şey haqqında. *..İştaham yox idi, gör xörəyin necə dadlıdır ki, hamısını yedim, hələ bir dadı damağımda da qaldı.* M.Hüseyn. // Heç unutmamaq, yadda saxlamaq. [Hacı Səmsam:] *..İndi sizə elə bir aş içirdim ki, ölənə kimi dadı damağınızdan getməsin.* P.Makulu.

**DAD²** *is.* [*fars*] 1. Fəryad, fəğan, haray. *Dedi: ayə nədir bu dadə səbəb; Halətin görsənir nəzərdə əcəb.* S.Ə.Şirvani. □ **Dad eləmək (etmək)** – fəryad etmək, fəğan etmək. *Dad eylərəm, yetişməzsən harayə; Neçün rəhmin gəlməz mən binəvayə?* Q.Zakir. *Hərçi dad eylədi, yahu; Eşidənlər dedi: – Yalandır bu!* M.Ə.Sabir.

2. Kömək, imdad. □ **Dad istəmək** – kömək istəmək, yardıma çağırmaq, xahiş etmək. **Dada gəlmək (çatmaq)** – bax **dada yetmək (yetişmək)**. *Yatmışları, razı deyiləm, kimsə oyatsın; Tək-tək ayılan varsa da, haqq dadıma çatsın.* M.Ə.Sabir. *Həsən hamının dadına çatır, hamının xeyrini, şərini görür.* S.Rəhman. *Hərdənbir qulaqucu oğlunun söhbətini eşidən Maral burada Züleyxanın dadına çatdı.* Ə.Əbülhəsən. **Dada yetmək (yetişmək)** – köməyə gəlmək, haraya gəlmək, kömək etmək. *Görüm indi kimlər yetər dadına; Koroğlunu tutan günlər necoldu?* "Koroğlu". *Vilayətdə gözəl çoxdu, nə fayda; Dərdi bilən, yetən dadə tapılmaz.* Q.Zakir. *Bu vaxtlar ləzgi Nüsrət ..* [Bağırın] *dadına yetişmişdi.* Ə.Məmmədxanlı. **Dadı heç yana çatmamaq** – heç kimdən kömək ala bilməmək, köməksiz qalmaq. *Padşah .. lap qəmgin oldu, amma dadı heç yana çatmadı.* (Nağıl).

3. Şikayət. □ **Dad çəkmək (etmək, eləmək, qılmaq)** – şikayət etmək, narazılıq etmək; şikayətlənmək. *Müxənnətdən dad elədim; Dost-aşnanı yad elədim.* "Koroğlu". *Xəstə Qasım kimə qılsın dadını; Canı çıxsın, özü çəksin odunu.* Xəstə Qasım. *Çoxları dad çəkdi, şivən qopardı; Döndərmə yazımı xəzanə, gözlər!* R.Rza. [Bənövşə:] *Sizin adınız gələndə həm mühəndislər, həm də fəhlələr dad çəkirlər.* S.Rəhman. **Dada getmək** – şikayətə getmək, şikayət etmək. *Qələm düşmən əlində; Kimə gedim dadə mən?* (Bayatı). *Çərxin sitəmindən, dövrün zülmündən; Gözəllər şahına dada gedirəm.* Q.Zakir.

**DAD³** *nida.* Aman, haray, vay. *Ey sevdiyim, səndən qeyri kimim var? Gəl üstümə, aman, öldüm, dad, öldüm!* M.V.Vidadi. *Əhdi pozub əgərçi mən üsyanın eylərəm; Ey dad, haray, nə növlə samanın eylərəm.* M.Ə.Sabir. // Çox vaxt "dad ... əlindən" şəklində işlənir. *Anlayana da can qurban, anlamayana da, dad yarımçıq əlindən.* (Ata. sözü). *Canım aldın mey üçün, saqi, içirdin mənə qan; Dad əlindən ki, məni al ilə məğbun eylədin.* Füzuli. *Aylar keçdi acı illərdən yaman; Dad sənin əlindən, hicran, ay hicran!* M.Rahim.

**DADAMAL** *sif. dan*. Bir şeyə (adətən arzu edilməyən şeyə) dadanmış, öyrəşmiş; vərdişli, adətkərdə. □ **Dadamal olmaq (öyrənmək, düşmək)** – adət etmək, öyrəşmək, dadanmaq, vərdiş etmək. *Bir də istəmədim ki, uşağım hər dəfə bazara çıxanda dadamal öyrənsin.* C.Məmmədquluzadə. **Dadamal öyrətmək** – dadandırmaq, alışdırmaq, öyrətmək.

**DAD-AMAN** bax **dad³**

**DADANAQ** bax **dadamal**. □ **Dadanaq olmaq** – öyrənmiş olmaq, yaxın olmaq, tanımaq.

**DADANDIRILMA** "Dadandırılmaq"dan *f.is.*

**DADANDIRILMAQ** *məch.* Öyrəşdirilmək, alışdırılmaq, dadanaq edilmək.

**DADANDIRMA** "Dadandırmaq"dan *f.is.*

**DADANDIRMAQ** *f.* Bir şeyin dadını daddırmaqla və ya başqa vasitə ilə alışdırmaq, bir şeyə dadanmasına səbəb olmaq, bir şeyə aludə etmək, dadanması üçün şərait yaratmaq; öyrəşdirmək, alışdırmaq.

**DADANIQ** bax **dadanaq**.

**DADANMA** "Dadanmaq"dan *f.is.*

**DADANMAQ** *f.* Bir şeyin dadını dadıb alışmaq; bir şeyə adət etmək, öyrəşmək, adətkərdə olmaq, aludə olmaq (adətən arzu edilməyən bir şeyə). *Motala dadanan köpək bir də gələr.* (Ata. sözü). *Canım, belə şey olmaz, axı! Görün bu zəhrimara dadanan kimdir?* Mir Cəlal.

**DADANMIŞ** *f.sif.* Bir şeyin dadını dadıb ona alışmış, adət etmiş, aludə olmuş. *Dadanmış qudurmuşdan betərdir.* (Ata. sözü). *Müftə qazanca dadanmış qoçular arasında rəqabət gedirdi.* A.Şaiq.

**DADAŞ** *is.* Kiçik qardaş və bacıların böyük qardaşa verdikləri ad; böyük qardaşa müraciət. *Bir gün gəldim, rəhmətlik dadaşıma dedim: – Dadaş, məni qoy dərsə.* C.Məmmədquluzadə. [Əntiqə:] *Dadaş, səsinə qurban olum!* Mir Cəlal. // Bəzən hörmət üçün, yaxud mehribanlıqla özündən böyüyə deyilir. *Hacı Ramazan dadaşımızın fikrinə bir şey gəldi və ürəkdən dərin bir ah çəkdi.* C.Məmmədquluzadə.

**DAD-BİDAD** *nida* [*fars.*] Adətən "ey dad-bidad" şəklində – təəssüf, kədər bildirir. *Müxtəsər, əqlim çaşıb, ey dad-bidad Ərdəbil; Bir də namərdəm, əgər etsəm səni yad, Ərdəbil!* M.Ə.Sabir. *Ey dad-bidad! Biz yatmışıq, sel az qalıb gələ, bizi basa!* M.İbrahimov. □ **Dad-bidad etmək (eyləmək)** – 1) ah-zar etmək, fəryad etmək; 2) ad çıxarmaq, qiyamət eləmək, gurultu qoparmaq; böyük müvəffəqiyyət göstərmək. *Dost yolunda yaxa yırtdım, baş açdım; Gecə-gündüz dad-bidad eylədim.* Qurbani.

**DADBİLMƏ** *is.* Bir şeyin dadını bilmə qabiliyyəti, dad duyğusu – beş duyğudan biri.

**DADBİLMƏZLİK** *is.* Dadbilmə hissinin olmaması.

**DAD-DAMAQ** *is.* Ləzzət, nəşə. *Yurd edəli Azərbaycanı; Dad-damaq vermisən bizim ellərə.* R.Rza.

**DADDIRMA** "Daddırmaq"dan *f.is.*

**DADDIRMAQ** *f.* 1. Dadına baxdırmaq, dadını-ləzzətini duyacaq dərəcədə yedirmək, ya içirmək.

2. *məc.* Hiss etdirmək.

**DAD-DUZ** *is.* B a x **dad**[1] 1-ci mənada. *Bu xörəyin dadı-duzu yoxdur. Dadına-duzuna baxmaq. – Nanə xala yeyir, bişirdiyi xörəyin dadını-duzunu soruşurdu.* Mir Cəlal.

**DAD-FƏĞAN** b a x **dad-fəryad**.

**DAD-FƏRYAD** *is.* [*fars.*] Köməyə çağırma. // Fəryad, fəğan, dad. □ **Dad-fəryad etmək (eləmək)** – imdada çağırmaq, köməyə çağırmaq.

**DADICI** *is. xüs.* Bir şeyin dadını müəyyən edən mütəxəssis; dequstator, dequstasiya mütəxəssisi.

**DADIXMA** "Dadıxmaq"dan *f.is.*

**DADIXMAQ** *f.* Çox qalmaqdan dadını itirmək, yaxud pis dadmaq, dadı korlanmaq.

**DADILMA** "Dadılmaq"dan *f.is.*

**DADILMAQ** *məch.* Dadına baxılmaq.

**DADIMLIQ** *is.* Dad, tam, şirinlik.

**DADIŞMAQ** *f. köhn.* Yumurta döyüşdürərkən onun bərkliyini dişə vurub yoxlamaq. *Məlumdur ki, uşaqlar yumurta döyüşəndə əvvəl bir dadışırlar, yəni yumurtalarını dəyişib vururlar dişlərinə.* C.Məmmədquluzadə.

**DADIZDIRILMA** "Dadızdırılmaq"dan *f.is.*

**DADIZDIRILMAQ** *məch.* Dadına baxdırılmaq, dadını, ləzzətini duyacaq dərəcədə yedirilmək, ya içirilmək.

**DADIZDIRMA** "Dadızdırmaq"dan *f.is.*

**DADIZDIRMAQ** b a x **daddırmaq**. *Südü uşağa dadızdırmaq.* – [Qətibə:] *Bəlkə də şair məni bu günün acılıqlarını dadızdırmaq üçün ölümdən qurtardı.* M.S.Ordubadi. // Azacıq yedirmək, ya içdirmək.

**DADIZMA** "Dadızmaq"dan *f.is.*

**DADIZMAQ** b a x **dadızdırmaq**. [Arılar] *bir qədər bal dadızdılar eşşəyə.* S.Ə.Şirvani. *Reyhan ürəyində bu xoruzdan bir tikə də olsa koxaya dadızmamağı qərara aldı.* S.Rəhimov.

**DADLANDIRMA** "Dadlandırmaq"dan *f.is.*

**DADLANDIRMAQ** *f.* Dad vermək, dada gətirmək, bir şey artıraraq dadlı etmək.

**DADLANMA** "Dadlanmaq"dan *f.is.*

**DADLANMAQ** *f.* Dada gəlmək, ləzzətli olmaq, dadlı olmaq. *Qar dağa çıxır, dadlanır.* (Ata. sözü).

**DADLI** 1. *sif.* Yaxşı dadı olan, ləzzətli. *Dadlı meyvə. Dadlı yeməklər. – Baxmaz guşeyi-çəşm ilə fəqiranə tərəf; Yüyürürsüz ora kim, dadlı, fisincanlı olur.* M.Ə.Sabir. [Piri baba:] *Onun balı çox dadlıdır.* S.S.Axundov. *Üç ay qabaq qazılmış quyu bol, dadlı və sərin su verirdi.* Ə.Vəliyev. // *məc.* Xoşagələn, ləzzətverən, ruhu oxşayan, ürəyəyatan, lətif, xoş, şirin. *Dadlı söz – can arzusu, dadsız söz – baş ağrısı.* (Ata. sözü). *Şairim! Seyr elə ətrafı, təbiət nə gözəl! Bax mənim hüsnümə, inşad elə bir dadlı qəzəl.* A.Səhhət. *..Hacı Qulu dadlı röyasından oyanmış kimi oldu.* A.Şaiq.

2. *is.* Xörəkdən sonra yeyilən şirniyyat, məzə. *..Konsulun evində təbrizlilərə məxsus*

*bütün şirniyyatı və dadlıları görmək mümkün idi.* M.S.Ordubadi.

**dadlı-dadlı** 1) *sif.* ləzzətli-ləzzətli, şirin-şirin. *Doyammadım dadlı-dadlı dilindən; Aman, Əslim, öylə sözlər söyləmə*! "Əsli və Kərəm"; 2) zərf mənasında. *Çobanlar tütək çalar, mahnı oxuyar, dadlı-dadlı söhbət edərdilər.* A.Şaiq. *Bişirərdi gözəl fisincanlar; Dadlı-dadlı lətif müsəmmalar.* A.Səhhət.

**DADLICA** *sif.* Çox dadlı, çox ləzzətli.

**DADLI-DUZLU** *sif.* Xoşagələn, gözəşirin, qanışirin.

**DADLILIQ** *is.* Dadlı şeyin hal və keyfiyyəti; şirinlik, ləzzətlilik. *Həyatın dadlılığı. Bulaq suyunun dadlılığı.*

**DADMA** "Dadmaq"dan *f.is.*

**DADMAQ** *f.* 1. Dadını, tamını bilmək üçün bir az yemək və ya içmək. – *Dadmaqla mal tükənməz.* (Ata. sözü). [Xanmirzə bəy:] *Sən məzhəbin haqqı, bu şərablardan bir az dad.* N.Vəzirov. // Ümumiyyətlə yemək, ya içmək. *Axşam azanı deyilən kimi mömin müsəlman bilmir ki, nəyə əl uzatsın; çaymı içsin, firnimi yesin, halvadanmı dadsın.* C.Məmmədquluzadə.

2. Müəyyən dad, tam vermək. *Şirin dadmaq. Acı dadmaq. Turş dadmaq.*

3. *məc.* Sınamaq, təcrübə etmək, hiss etmək, duymaq. *Qoy nakam getməsin dünyadan o qız; Dadsın hər arzunun yüz nemətini.* S.Vurğun. *Narıngül isə ağır və acı dövranın müqabilində artıq bəxtəvər həyatın meyvələrini dadmışdı.* Ə.Vəliyev. // *məc.* Çəkmək, düçar olmaq, məruz qalmaq, görmək, keçirmək, başına gəlmək. *Həyatın acılığını dadmaq.*

4. *məc.* Qanmaq, anlamaq, başa düşmək, duymaq. *Əsgərin ağlı koxanın danışığından bir şey dadmadı.* S.Rəhimov.

**DADMALI** 1. *is.* Yeməli, ya içməli şey. *Beləliklə, bu adamlar barmaqlarını batırıb dadmalını dadardılar.* S.Rəhimov.

2. *sif.* Dadlı, ləzzətli. *Dadmalı şey.*

**DADRƏS** *is.* [*fars.*] *klas.* Köməkçi, müdafiəçi, himayəçi, dada çatan. *Dildadələrin dadrəsi, yavəri sənsən.* Q.Zakir. *Mən fəqiri bəsləmişsiz orada; Dadrəsim bunda yetişsin dada.* Aşıq Pəri. *Fəryadına yetdiklərin imdadına yetməz; Fikr etmə, bu aləmdə, könül, dadrəsin var.* Ə.Vahid.

**DADSIZ** *sif.* Dadı olmayan; ləzzətsiz, tamsız. *Dadsız xörək. Dadsız meyvə.* // *məc.* Heç bir zövq və nəşə verməyən; mənasız, maraqsız. *Dadsız ömrü nə eylərdim? Əzəldən; Mən səninçün düşmədimmi qovğaya?* Ə.Cavad.

**DADSIZLIQ** *is.* 1. Dadı, ləzzəti olmayan şeyin hal və keyfiyyəti. *Xörəyin dadsızlığı. Yemişin dadsızlığı.*

2. Dad, tam duymama, dad bilməmə. *Ağzının dadsızlığı.*

**DADÜ-BİDAD** bax **dad-bidad**.

**DADÜ-FƏRYAD** bax **dad-fəryad**. *Gör hesabın mən çəkdiyim azarın; Bu dadü-fəryadın, bu ahü-zarın.* M.P.Vaqif. *Əgər dadü-fəryada tez yetişməsək, mümkündür ki, millətdən bir əsər dəxi qalmaya.* C.Məmmədquluzadə.

**DADVERİCİ** *sif.* Müəyyən dad verən, dadlandıran, dad gətirən. *Dadverici maddələr.* – *Təbiətdə cirədən dadverici maddə kimi geniş miqyasda istifadə edilir.* R.Əliyev.

**DAĞ**[1] *is.* 1. Yerin hündür, dik, yamaclı və zirvəli hissəsi. *Qafqaz dağları.* – *Dağ dağa rast gəlməz, adam adama rast gələr.* (Ata. sözü). *Adətən ətəyi, yamacları və zirvəsi nisbətən aydın görünən hər hansı bir yüksəkliyə dağ deyilir.* "Ümumi fiziki coğrafiya". *Buludlara dəyir uca dağları; Cənnət guşəsidir gözəl bağları.* A.Səhhət. ☐ **Dağın döşü** – dağın ön və orta tərəfi, azca mail səthi; dağdöşü. *Onlar asta-asta dağın döşünə qalxırdılar.* S.Rəhimov. *Dağın döşündə otlayan heyvanlar qara nöqtələr kimi xırdaca görünürdü.* M.Hüseyn. **Dağın ətəyi** – dağın başlandığı yer, dağın yerlə birləşən aşağı hissəsi; dağətəyi. *Kənd dağın ətəyində yerləşmişdir.* **Sıra dağlar** *coğr.* – hər hansı bir istiqamətdə uzanan dağ silsiləsi. *Qafqaz sıra dağları. Ural sıra dağları.* – *Keçərək Mil düzündən sıra dağları aşdım; Kürün sahilləriylə bütün eli dolaşdım.* Ə.Cəmil. *Ətrafa baxdıqca təpələr, qayalar və zirvəsi qarlarla örtülmüş Kiçik Qafqaz sıra dağları görünürdü.* S.Şamilov.

2. Yaylaq, dağüstü düzənlik; "*aran*" qarşılığı olaraq uca yer, dağlıq yer. *Köçün dağ-*

*dan gələndə; Bir quzu qurban, yeznə!* (Bayatı). *Bir qədər çaydan uzaq; Od qalamış dağda çoban.* A.Səhhət. *Külfəti dağa çatdırmaq üçün çoxlu pul lazım idi.* Mir Cəlal.

3. *məc.* Çox möhkəm, əzəmətli, sarsılmaz şey haqqında. *Bənzərəm bir qocaman dağa ki dəryada durar.* M.Ə.Sabir. *Sən qoçaqlar içində qoçaqsan gözlərimdə; Ürəyi alov dolu bir dağsan gözlərimdə.* S.Rüstəm.

4. *məc.* Çoxluq, böyüklük, ucalıq kimi təşbeh bildirir (çox zaman "kimi" qoşması ilə birlikdə işlənir). *Kitablar dağ kimi yığılmışdır. Buldozerlər dağ kimi qalanan torpaq yığınlarını dağıdır. – Dənizdə çarpışardın dağ boyda dalğalarla; Sahildə əl-qol atıb gəzişərdin vüqarla.* S.Rüstəm. *Çay da bəzən dağ boyda böyüyür, köklü ağacları qoparıb gətirir, atıb-tuturdu.* Ə.Vəliyev.

◊ **Dağ dağa (qayaya) rast gəlib** – mübahisə edən iki adamdan heç birisinin güzəştə getməməsi mənasında. **Dağ kimi (dalında) durmaq** – bütün varlığı ilə müdafiə etmək, himayə etmək. *Qorxma, dağ kimi dalında durmuşam.* **Dağa dönmək** – 1) genişlənmək, çox böyümək; 2) ürəyi iftixar hissi ilə dolmaq. **Dağı dağ üstə qoymaq** – çox böyük iş görmək, hünər göstərmək, çox böyük və ağır bir işin öhdəsindən gəlmək. *Bütün yoldaşlarımız Araz kimi olsaydı, dağı dağ üstə qoyardıq.* A.Şaiq. **Dağı dağ üstündən atmaq** – b a x **dağı dağ üstə qoymaq**. *Ağa Dərviş demək istəyir ki, beş nəfər adam birləşsə, dağı dağ üstündən atar, mən cavab verdim ki, iki nəfər adam da kifayətdir.* N.Vəzirov. **Dağlara düşmək** – ev-eşiyindən avara olmaq; avara-sərgərdan olub insan yaşamayan yerləri gəzmək. *Biçarə Kərimin halı pərişan; Gör ki Məcnun olub, dağlara düşüb.* Mücrim Kərim.

**DAĞ**[2] [*fars.*] 1. *is.* Damğa, qızdırılmış dəmirlə qoyulmuş iz. ☐ **Dağ basmaq** – qızdırılmış dəmirlə bədənə damğa basmaq.

2. *sif.* Qaynamaqda olan, qaynar. *Saleh dağ sudan çaynikə alıb, onu çalxadı.* M.İbrahimov. *Gör bu çayniki vağzalda dağ su ilə doldura bilərsənmi?* Mir Cəlal. ☐ **Dağ eləmək** – Sonadək əridilən şey. *O, yağ gətirdi, dağ elədi, bir azdan da bal töküb,* [halva] *hazır etməyə başladı.* S.Rəhimov. **Dağ olmaq** – qızmaq, ərimək. *Dağ olmuş yağın gözəl qoxusu bütün ev-eşiyi bürüməkdə idi.* Ə.Vəliyev.

3. *is. məc.* Ağır dərd, qəm, kədər, qüssə, ürək yarası. *Ayrılıq dağı. Övlad dağı. – Əzizim, qardaş dağı; Qaf dağı, qardaş dağı; Hər dağ olsa, çəkilər; Çəkilməz qardaş dağı.* (Bayatı). *Vidadi xəstəyəm, ey gözüm sağı! Artıbdır sinəmin düyünü, dağı.* M.V.Vidadi. *Nə yaman dağ imiş oğul dağı.* X.Natəvan. // Şiddətli təsir.

◊ **Dağ basmaq (bədəninə, ciyərinə, ürəyinə** və s.**)** *məc.* – b a x **dağlamaq** 3-cü mənada. [Fatma xanım:] *Ey yeri-göyü yox yerdən yaradan Allah! Məni il yarımdır ağlar qoyubsan, gülüzlü qızımı əlimdən alıbsan, mənim ciyərimə dağ basıbsan!* C.Məmmədquluzadə. *Ağadır, xozeyindir, qəbul; daha mənim canıma dağ basmağa nə haqqı var?* Mir Cəlal. **Dağ qoymaq, dağ çəkmək** – b a x **dağ basmaq**. *Bivəfa yar sinəmə; Dağı çəkib dağ üstdən.* (Bayatı). [Saranın] *ölümü mənim sinəmə dağ çəkdi.* C.Cabbarlı. *Sədəfin ölümü ürəyimə çal-çarpaz dağ çəkdi.* M.Hüseyn.

**DAĞAL** *sif.* və *is. dan.* Cığal; davakar. *Dağal adam. Oyuna dağal qatmaq* (cığallıq eləmək).

**DAĞALLIQ** *is. dan.* Cığallıq, davakarlıq. *Zeyğəm, Bəşir və Məmmədağa dağallığa başlamışdılar.* S.Rəhimov.

**DAĞAR** *is. köhn.* 1. Qaramal dərisindən hazırlanan torba. *Köçəri skiflər dəri qab – xəz torba* (dağar) *və matra* (suqabı) *işlədirdilər.* "Qədim dünya tarixi".

2. Keçmişdə: üzərində qaytan toxumaq üçün içi əsgi-üsgü və ya yun ilə bərk doldurulub bağlanmış meşin yastıq.

**DAĞARCIQ** *is.* Kiçik dağar; çox vaxt dəridən tikilən kiçik torba, çanta. *Dağarcığını çuvala tay tutur.* (Ata. sözü). *Amma məbada dağarcığın ağzı bərk bağlanmış olmuya, əgər pişik oradan özünü xilas eləsə, üz-gözünü cırmaqlayıb qanadar.* C.Məmmədquluzadə. *Dilənçi dağarcığından bir qədər çörək və soğan çıxardıb, Nurəddinə verdi.* S.S.Axundov. [Qəhrəman:] *Bütün məktəb uşaqları kimi biz də dağarcığa qum doldurub .. gətirirdik.* Ə.Vəliyev.

◊ **Sirr dağarcığı** – sirr ilə dolu, anlaşılmaz, başçıxarılmaz adam, şey haqqında. [Nurcahan:] *Mən başdan-ayağa sirr dağarcığıyam.* N.Vəzirov. *Ancaq .. əmək haqqı bölgüsü olub sirr dağarcığı.* "Kirpi".

**DAĞAYISI** *is.* 1. *zool.* Dağlıq yerlərdə yaşayan ayı növü.

2. *məc. dan.* Mədəniyyətsiz, qaba, qanacaqsız adam haqqında.

**DAĞBASAR** *is.* Dağətəyi, dağ həndəvəri. *Dağbasarda yaşayanlar. Dağbasar havası.*

**DAĞBƏYİ** *is. tar.* Yayda dağa köçən köçərilərin inzibati işlərini idarə edən hökumət məmuru. *Nəbi yenə burda bir ad elədi; Dağbəyini tutub nə ad elədi!* "Qaçaq Nəbi".

**DAĞBOYANASI** *is. bot.* Çətirçiçəklilər fəsiləsindən çoxillik ot bitkisi.

**DAĞ-DAĞ**[1] *sif.* Dağ kimi uca, çox yüksək.

**DAĞ-DAĞ**[2] *sif.* 1. Çox isti, qaynar. *Dağ-dağ su.*

2. *məc.* Çox dərdli. *Ana yalqız dayanıb; Ananın qəlbi dağ-dağ.* R.Rza.

**DAĞDAĞA**[1] *is.* b a x **dəğdəğə**. *Çöllərdə var bağalar; Ürəkdə dağdağalar; Yarın vurduğu yara; Məhşər günü sağalar.* (Bayatı). *Elə belə, ürəyimə dağdağa düşüb ki, görəsən, sən kimsən?* "Koroğlu". [Əlimərdan:] *Hə, indi bildim ki, ağ ilan bir şey bilirmiş. Yoxsa, bunu mən cin-şəyatin dağdağası sayırdım.* (Nağıl).

**DAĞDAĞA**[2] *is. məh.* Kiçik taxta parçasından qayrılan və fırladarkən kəskin, uğultulu səs çıxaran uşaq oyuncağı.

**DAĞDAĞAN** *is. bot.* 1. Bərk oduncağı olan, meşələrdə bitən bir ağac və ya kol.

2. Dağdağan ağacının noxud iriliyində olan şirin meyvəsi.

3. Köhnə məişətdə: dağdağan ağacından qayrılaraq, guya pis gözdən qorumaq üçün uşağın papağına bənd edilən, yaxud bəzi ev heyvanlarının boynundan asılan şey. *Papağına dağdağan tikmək. Dananın boynuna dağdağan asmaq.*

**DAĞDAĞANLIQ** *is. bot.* Dağdağan ağacları bitən yer. *Dağdağanlıqda bir ayı gördük. Dağdağanlıqda sərinlənmək.*

**DAĞ(İ)DAR** *sif.* [*fars.*] *klas.* Dağlı, ürəyi dağlı, çox kədərli, yaralı. *Dağidar ürək.* // *İs. mənasında.* Ürəyi dağlı adam. *Ey sariban, qətarimizi kuyi-yarə çək; Rəhm et, bu dağidarları laləzarə çək.* S.Ə.Şirvani. ☐ **Dağ(i)dar etmək** *məc.* – yaralamaq, dağlamaq.

**DAĞ-DAŞ** *is.* Yolu olmayan, yaşamaq üçün yararsız olan təpəlik və daşlıq yerlər. [Səlim qızı:] *..Aydəmir də, bilirsən ki, dağdadaşda, ona qızmı yaraşar?* C.Cabbarlı. [Əmiraslan baba:] *Bax, o zaman bizim bu Ağbulaq obasına, dağ-daşdan keçən darısqal cığırlarla, birtəhər, güc-bəla ilə gəlmək olardı.* S.Rəhimov. // Ümumiyyətlə, dağlıq, qayalıq, təpəlik. *Su gələr axar, doymaz; Dağdaşı yıxar, doymaz.* (Bayatı). *Hər kim məni belə görə, bil, ağlar; Dağ-daş yanar; ulus, oymaq, el ağlar.* M.V.Vidadi. // *məc.* Cansız təbiət mənasında. *Qanad verir dağa-daşa; Ana yurdun havaları.* S.Vurğun.

◊ **Dağa-daşa düşmək** – 1) ev-eşiyindən avara olmaq; avara-sərgərdan olub insan yaşamayan yerləri gəzmək; 2) axtarmaq. **Dağa-daşa salmaq** – çətinliyə salmaq, ora-bura göndərmək, avara etmək. *Di belə de, rəhmətliyin oğlu, ta məni niyə dağa-daşa salırsan?* C.Məmmədquluzadə. **Dağa-daşa sığmamaq (sevinməkdən, şadlıqdan)** – sevincinin həddi-hüdudu olmamaq. *Biz sevincimizdən dağa-daşa sığmırdıq.* Mir Cəlal. **Dağdaş dilə gəlmək, dağ-daş titrəmək (səsdən, fəryaddan, nərədən** və s.-dən**)** – çox güclü səs, gurultu haqqında. *Yazıq heyvan elə bağırdı ki, səsindən dağ-daş titrədi.* A.Şaiq. **Özünü dağa-daşa vurmaq (çırpmaq)** – öz məqsədinə çatmaq və ya başqa səbəbə görə heç bir çətinlikdən qorxmayaraq özünü hər yerə vurmaq, yorulmaq bilmədən çalışmaq. *Hərgah maral bilsə ki, bu səs-şıppıltı yel əsib kolu tərpətməkdən, yarpaqları bir-birinə toxundurmaqdan əmələ gəlir, o vaxt o, qorxmaz və qorxudan özünü dağadaşa çırpmaz.* F.Köçərli. [Zeynəb xanım:] *Mənim yəqinimdir ki, o dinc olmayacaq, özünü dağa-daşa vuracaqdır.* N.Vəzirov.

**DAĞ-DƏRƏ** *is.* b a x **dağ-daş**. *Dağ-dərəni dolannam; Dərya kimi bulannam.* (Bayatı). [Kərimqulu:] *Bir də bu qızı kola-kosa, dağdərəyə buraxma!* S.Rəhimov. *İki qardaş ömür sürür; Dağ-dərədə uzun zaman.* B.Vahabzadə.

**DAĞDİBİ** *sif.* Dağın lap aşağı hissəsində olan.

**DAĞDÖŞÜ** *is.* Dağın ön və orta tərəfi, azca mail səthi. // *sif.* Dağın döşündə yerləşən. *Dağdöşü otlaqlar.*

**DAĞƏTƏYİ** *sif.* Dağın düzənliyə qovuşan maili tərəflərində yerləşən. *Dağətəyi zonalar. Azərbaycanın dağətəyi və dağlıq rayonlarında əkmək üçün xaşa ən münasib çoxillik paxlalı bitkidir.* // *is.* Dağın ətəyində yerləşən sahə.

**DAĞIDICI** *sif.* Dağıdan, dağıtmağa qadir olan. *Zərbə dalğasının dağıdıcı təsiri.* // Pozucu, pozğunluq salan, çox zərərli.

**DAĞIDICILIQ** *is.* Dağıtma qabiliyyəti. *Atom bombasının dağıdıcılıq qüvvəsi.*

**DAĞIDILMA** "Dağıdılmaq"dan *f.is. Mən özüm .. küçədən keçərkən yenə bir nəfər pristavın dükanın dağıdılmasına mane olduğunu gördüm.* M.S.Ordubadi.

**DAĞIDILMAQ** "Dağıtmaq"dan *məch.*

**DAĞIDILMAZ** *sif.* Dağıdıla bilməyən; yıxılmaz, yenilməz.

**DAĞIDILMAZLIQ** *is.* Dağıdılmaz şeyin hal və keyfiyyəti; yıxılmazlıq, yenilməzlik.

**DAĞILIŞMA** "Dağılışmaq"dan *f.is.*

**DAĞILIŞMAQ** *qarş.* Dağılmaq (çoxları haqqında), bir-birindən aralanıb müxtəlif tərəflərə getmək, hərə bir tərəfə getmək. *Qonaqlar dağılışdılar. – Quzular yenə çölə dağılışaraq otlayırdı.* M.İbrahimov. *Axıra qalmış qonaqlar da dağılışır, İmanova ürək-dirək verirdilər.* M.Hüseyn.

**DAĞILMA** "Dağılmaq"dan *f.is.*

**DAĞILMAQ** *f.* 1. Sökülmək, uçulmaq, alt-üst olmaq, xaraba halına gəlmək. *Daşqın zamanı bəndlər dağıldı. Zəlzələdən çoxlu ev dağılmışdır. Körpü seldən dağıldı.* // Bərbad hala gəlmək, pozulmaq. *Təsərrüfat dağıldı.*

2. Çox işlənməkdən, geyilməkdən, sürtülməkdən yaramaz hala gəlmək, cırılmaq, yırtılmaq, parça-parça olmaq. *Ayaqqabı dağılmışdır.*

3. Darmadağın olmaq, məhv olmaq, ortadan çıxmaq, öz varlığını itirmək, süqut etmək. [Aslan bəy:] *..Bütün dünya dağılsa da, dediyini edəcək, gələcəyəm söylədisə, ölsə, qalsa gələcək.* C.Cabbarlı. *Qoşunun başçısı ölsə də, möhkəm qoşun dağılmaz.* M.Hüseyn.

4. *məc.* Yavaş-yavaş seyrəkləşərək, yayılaraq yox olmaq, çəkilib getmək. *Duman dağıldı.* // *məc.* Puç olmaq, boşa çıxmaq, baş tutmamaq, alt-üst olmaq. *Bütün ümidlərim dağıldı.*

5. Pərakəndə halda, necə gəldi ora-bura tökülmək. *Muncuqlar qırılıb yerə dağıldı. Un kisədən dağıldı.*

6. Tökülmək, o tərəf-bu tərəfə axıb getmək. *Su dağıldı. Süd dağıldı.*

7. Pərakəndə halda tökülmək. [Güllü nənənin] *qar kimi dümağ pırtlaşıq saçları mütəkkənin üstünə dağılmışdı.* S.Rəhimov.

8. *məc.* İflas etmək, vardan-yoxdan çıxmaq, kasıblaşmaq. [Məşədi İbad:] *A kişi, vallah, mən dağıldım, mən söküldüm, mən bu qədər pulu haradan alım verim.* Ü.Hacıbəyov.

9. Müxtəlif tərəflərə getmək, hərə bir yana getmək, çəkilib getmək, dağılışmaq (bir yerə yığılmış çoxlu adamlar, quşlar və s. haqqında). *Veylabad şəhəri elə bil dəyişmişdi. Hərə bir tərəfə qaçıb dağılmaqda idi.* Çəmənzəminli. *..Xəlfə cibinə tökdüyü noğul-badamdan soldatların və Əlirzanın ovcuna basırdı. Bundan sonra hərə öz evinə dağılırdı..* H.Sarabski. *Şirinlik içilən axşam qonaqlar mübarəkbadlıq edib dağıldı.* Mir Cəlal.

10. Yayılmaq, intişar etmək. *Üç minə yavuq nüsxəmiz Krım, Qazan, Orenburq və qeyri şimali müsəlman şəhərlərində və kəndlərində dağılır.* C.Məmmədquluzadə.

11. Səpələnmək. *Maşınlar, insanlar dağılır düzə; Çoxalır səhrada gediş-gəliş də.* S.Vurğun.

12. Qurtarmaq, sona çatmaq, tamam olmaq, öz işini qurtarmaq (məclis, iclas və s. haqqında). [Şah] *əfradi-məclisi mürəxxəs etdi. Məclis dağıldı.* M.F.Axundzadə. *Bir az əvvəl bulaq başındakı arvad yığıncağı dağılmışdı.* Ə.Vəliyev.

13. Əmr şəklində: **dağılsın!** – xaraba qalsın! məhv olsun! alt-üst olsun! (qarğış). *Dağlarda talam qaldı; Biçmədim, lalam qaldı; Dağılsın qürbət ölkə; Orda bir balam qaldı.* (Bayatı).

**DAĞILMIŞ** 1. "Dağılmaq"dan *f.sif.*

2. Qarğış mənasında. [Zaman:] *O günə daş düşəydi ki, sən mənim dağılmış xarabamın qapısından girdin.* Ə.Haqverdiyev. *Müsafirlərdən*

*bir çoxu: – Bu dağılmışda heç vaxt sağlam bir hava görmədim, – deyə Culfa mühitinə nifrət yağdırırdı.* M.S.Ordubadi. [Kəndli:] *Görəsən, bu dünya üzündə bu dağılmışdan da pis yer varmı?* S.Rəhimov.

**DAĞIM-DAĞIM** *zərf* Parça-parça, doğram-doğram; yırtıq. *Dağım-dağım etmək. Dağım-dağım olmaq. – Hələ partlayış davam edir, mərmi və mina ilə dağım-dağım olan yerin bağrından tüstülər qalxırdı.* Ə.Əbülhəsən.

**DAĞINIQ** *sif.* 1. Uçuq, sökük; uçulmuş, sökülmüş; xaraba halına gəlmiş. [Tərlan] *əvvəlcə məktəbin geniş həyətinə, sonra da dağınıq kənd evlərinə baxdı.* M.Hüseyn. *Dağınıq və uçuq evləri görərkən .. yolçunun ürəyi sıxıldı.* Ə.Məmmədxanlı.

2. Nizamsız halda tökülmüş, pərişan (saç və s. haqqında). *Fəridə saçları dağınıq* (z.) *halda içəridən yüyürüb eyvana çıxır.* Ə.Məmmədxanlı. *Elə bil baharıma qar yağdırır bu baxış; Dağınıq saçlarını küləklərmi daramış?!* Ə.Cəmil.

3. Yığcam olmayan, qeyri-müəyyən, rabitəsiz, aydın olmayan, yayğın, uzun. [Dəli Səməd] *başlardı öz-özünə dağınıq sözlər söyləməyə və söylədikcə də gah gülüb, gah da hirslənib qaşqabağını turşudardı.* Çəmənzəminli. *Qocanın fikri dağınıqdır.* M.Hüseyn.

**DAĞINIQLIQ** *is.* Dağınıq şeyin halı. *Fikrin dağınıqlığı.*

**DAĞINTI** *is.* Yıxılmaq, uçulmaq, dağılmaq və ya sökülmək nəticəsində əmələ gələn yığın, qalaq, töküntü; xarabalıq. *Müharibə nəticəsində əmələ gəlmiş dağıntı.*

**DAĞINTILIQ** *is.* Dağıntı çox olan yer; xarabalıq.

**DAĞISTANLI** *is.* Dağıstanda yaşayan yerli xalqlardan birinə mənsub olan adam.

**DAĞITDIRMA** "Dağıtdırmaq"dan *f.is.*

**DAĞITDIRMAQ** "Dağıtmaq"dan *icb.*

**DAĞITMA** "Dağıtmaq"dan *f.is.*

**DAĞITMAQ** *f.* 1. Sökmək, uçurmaq, xaraba qoymaq, alt-üst etmək. *Köhnə binanı dağıtmaq. Zəlzələ evlərin çoxunu dağıtdı.* – [Zaman xan:] *Ona binaən əmr etdim ki, .. körpüləri dağıtsınlar və yolları pozsunlar.* M.F.Axundzadə. *Bu saat yenə sultanın qoşunları İranın bu guşəsini söküb kəndləri dağıtmaqdadır.* C.Məmmədquluzadə. ☐ **Vurub-dağıtmaq** – yox etmək, aradan qaldırmaq. *Deyəsən, bu səs o qədər qüvvətli idi ki, dəmir yolu ilə şəhər arasında olan bütün həddi-səddi vurub dağıtdı.* Mir Cəlal.

2. Yaralamaq. *Nəbi ağacnan bir hampanın başını dağıtdı.* "Qaçaq Nəbi". *Başını qaldırıb ətrafına baxmaq istərkən, ikinci güllə onun çiynini dağıtdı.* Ə.Məmmədxanlı. // Dişi ilə parçalamaq, parça-parça etmək. *Öküzləri dağıtmaq istəyən canavar birdən qabaqdan kəhər ata cumdu.* Ə.Vəliyev.

3. Pərən-pərən salmaq, qovmaq. *Qoşun yavaş-yavaş xırda yığıncaqları dağıtmağa başladı.* M.S.Ordubadi. // Dağılışmağa, dağılıb getməyə məcbur etmək. *Kəblə Səməd dayı durub camaatı dağıtdı.* S.Rəhimov.

4. Qarət etmək, tarac etmək, soymaq, iflasa uğratmaq. *..Nahaq iş tutmasınlar, xalqı talayıb dağıtmasınlar.* M.F.Axundzadə. [Hacı:] *Xarici bu fabriki dağıtmaq istəyir.* M.S.Ordubadi.

5. Dağılmasına, bədbəxt olmasına səbəb olmaq. *Hakim təbəqələr pul və dövlət gücünə harınlıq edərək, nə qədər ismətli və həyalı ailələri dağıtmışlar.* M.İbrahimov.

6. Çox geymək, işlətmək, sürtmək və s. nəticəsində yırtmaq, cırmaq, yararsız hala salmaq. *Paltarı dağıtmaq. Ayaqqabılarını dağıtmaq.* // Ümumiyyətlə, yırtmaq. *Bütün maskaları dağıtmasaq biz; Faydasız qalacaq mübarizəmiz.* S.Vurğun.

7. Nizamsız halda tökmək, pərişan hala salmaq. *Bir tərəf şanə dağıtdı zülfünü, bir yan səba; Hər tərəfdən hər biri könlüm pərişan etdilər.* S.Ə.Şirvani. // Yolmaq mənasında. *Yar odur kim, yardan sonra yar üçün; Zülf dağıda, yaxa darta, yara üz.* Qurbani.

8. Müxtəlif tərəflərə yaymaq, intişar etmək, saçmaq. *Dan yeli hər yana ətir dağıdır; Çöllərə çəkilir bir yaşıl pərdə.* A.Şaiq. *O şad olur, o sevinir balasının hünərindən; Günəş qalxıb nur dağıdır ona vətən göylərindən.* S.Vurğun.

9. Dağılmasına səbəb olmaq. *Suyu dağıtmaq.*

10. Özündən uzaqlaşdırmaq, qovlamaq. *Mehriban ağlayırdı. O, ürəyini şişdirən ələm*

*və kədərlərini bununla dağıtmaq istəyirdi.* S.Hüseyn. *..Dərdi-sərimi dağıdan, viran könlümü gülüstan edən Ruqiyyə idi, Ruqiyyə!* A.Divanbəyoğlu. // Qaçırmaq, pozmaq. *Dağıtmış yuxumu yenə gözümdən; Əzəldən nəğmələr aşiqiyəm mən.* S.Vurğun.

11. Səpmək, tökmək. *Adsız ölən igidlərin o pərişan məzarına; Çiçək səpir qucaq-qucaq, gül dağıdır ətək-ətək.* S.Vurğun.

12. Əbəs yerə xərcləmək, səmərəsiz sərf etmək, puç etmək. *Tahirin əlinə İran sikkəsi düşəndə dağıtmayıb cibində saxlayırdı.* S.Rəhimov.

**DAĞKEÇİSİ** *is. zool.* Dağlıq yerlərdə yaşayan vəhşi keçi növü. *Ətraf əhali hər il bu dağdan dağkeçisi vurardı.* Ə.Vəliyev. *Cüyür, dağkeçisi tutub dünyanı; Bizim yerlər kimi gözəl yer hanı?* Z.Xəlil.

**DAĞKEŞNİŞİ** *is. bot.* Dağlıq yerlərdə bitən, keşnişə oxşayan birillik bitki (tərəvəz kimi istifadə olunur). *Dağkeşnişinin acımtıl dadı olur.*

**DAĞKƏLİ** *is zool.* Dağlıq yerlərdə yaşayan vəhşi kəl.

**DAĞQOÇU** *is. zool.* Dağlarda yaşayan vəhşi qoç.

**DAĞLALƏSİ** *is. bot.* Əksərən dağlarda bitən soğanaqlı çiçək bitkisi. *Bu yerlərdə nə istəsən taparsan: ..sarmaşıqmı, dəvəçiçəyimi, məxmərgülümü, dağlaləsimi?!* Mir Cəlal.

**DAĞLAMA** "Dağlamaq"dan *f.is.*

**DAĞLAMAQ** *f.* 1. Qızdırılmış dəmirlə damğa vurmaq. *Qoyunları dağlamaq. Atı dağlamaq. – Adamı ürəkdən, heyvanı budundan dağlarlar.* (Ata. sözü).

2. *məc.* Yandırmaq. *..Şaxta qızmar bir dəmir kimi onu dağlayır.* Ə.Məmmədxanlı.

3. *məc.* Adətən "ürəyini", "sinəsini", "qəlbini" sözləri ilə – çox bərk təsir etmək, yandırmaq, yaralamaq, dərd və kədər vermək. *Qılınc çəkib mərd meydana varanda; Sinələr çal-çarpaz dağlayan mənəm.* "Koroğlu". *Dağlar dağladı məni; Görən ağladı məni; Zəncir, buxov tab etməz; Zülfün bağladı məni.* (Bayatı). [Heydər bəy:] *Sona xanım, ürəyimi dağlama, çünki tablaşa bilmərəm, atı min, gedək!* M.F.Axundzadə. *Ey qoca bir qövmə ağlarkən gülən: Naləsilə xalqı dağlarkən gülən.* A.Səhhət.

**DAĞLANMA** "Dağlanmaq"dan *f.is.*

**DAĞLANMAQ** "Dağlamaq"dan (3-cü mənada) *məch.* [Fatma xanım:] *Səni öyrədənin ciyəri dağlansın!* N.Vəzirov. [Abdulla xan:] *Ürəyim Pərviz xandan dağlanıb.* Ə.Haqverdiyev.

**DAĞLATDIRMA** "Dağlatdırmaq"dan *f.is.*

**DAĞLATDIRMAQ** "Dağlatmaq"dan *icb.*

**DAĞLATMA** "Dağlatmaq"dan *f.is.*

**DAĞLATMAQ** "Dağlamaq"dan *icb.*

**DAĞLI[1]** *is.* Dağlıq yerdə yaşayan adam. *Burada dağlılar yaşar bəxtiyar; Qürurdan aralı, kindən aralı.* S.Vurğun. // Dağıstanlı, Dağıstan əhli. *Keçmiş əsrin altmışıncı illərində .. bir mütəxəssis rus əlifbasını dağlıların məxrəcinə görə tətbiq etmişdir.* F.Ağazadə. // Sif. mənasında. *Dağlı əhali.*

**DAĞLI[2]** *sif.* 1. Qızdırılmış dəmirlə damğa vurulmuş, damğası olan. *Dağlı heyvan. Dağlı at.*

2. *məc.* Adətən "sinəsi", "ürəyi", "qəlbi" sözləri ilə – çox dərdli, çox qəmli, çox mütəəssir, ürəyi yaralı. *Ürəyi dağlı adam. – Qəribəm, ağlaram aləm içrə mən; Ciyəri eşq oduna dağlıyam mən.* "Aşıq Qərib". [Tamara:] *Bir dustağam, qolum bağlı; Bir qəribəm, sinəm dağlı.* S.Vurğun. *Övlad sarıdan Murad kişinin ürəyi əvvəldən dağlı idi.* Mir Cəlal.

**DAĞLIQ** 1. *sif.* Dağı çox olan. *Dağlıq ölkə. Dağlıq yerlər.* [Dağıstanın] *..o biri dağlıq qismi .. yaşamaq üçün çox çətin və məşəqqətlidir.* A.Bakıxanov. // Dağ üstündə olan. *Vaxtı ilə dərə-təpəlik olan yuxarı dağlıq hissə indi gül-çiçəyə bəzənmişdir.* (Qəzetlərdən).

2. *is.* Dağlıq yer. *Dağlıqda tütün yaxşı bitir.*

**DAĞLILIQ** *is.* Dağlıq yerin halı.

**DAĞNANƏ(Sİ)** *is. bot.* Əsasən dağlarda bitən xoşiyli çoxillik ot bitkisi. *Yumşaq otların, əlvan çiçəklərin, dağnanələrinin gözəl qoxusundan adam bihuş olurdu.* A.Şaiq.

**DAĞNOVRUZU** *is. bot.* Çoxillik çiçək bitkisi.

**DAĞSAQQIZI** *is. bot.* Dağlarda bitən kauçuklu bitki.

**DAĞSİÇANI, DAĞSİÇOVULU** *is. zool.* Tarla və bostan bitkilərinə zərər verən gəmirici.

**DAĞTƏRXUNU** *is. bot.* Təbabətdə işlənən ot və yarımkol bitki.

**DAĞTURPU** *is. bot.* Uzunsov yarpaqlı ikiillik ot bitkisi. *Becərilmə üsulu ilə yetişdirilən, dağturpu ikiillik ot bitkisidir. Gövdəsinin uzunluğu 30-80 sm-ə çatır. Yarpaqları uzunsov, kənarı diş-diş və bəzən hamar olur.* R.Əliyev.

**DAĞÜSTÜ** *sif.* Dağın üstündə olan, hündür yerdə olan. *Dağüstü park. – ..Çalbayır dağlarından başlamış dağüstü Şuşaya, Əsgəran qalasına qədər nazik qar yer üzünü örtür..* S.Rəhimov.

**DAHA** *əd.* 1. Sifətlərdən əvvəl gələrək çoxaltma dərəcəsi əmələ gətirir. *Daha yaxşı. Daha bərk. Daha sağlam.* // Zərflərlə birlikdə işləndikdə müqayisə dərəcəsi düzəltməyə xidmət edir. *Əvvəlkindən daha bərk yağır. Bu il yay keçən ilkindən daha isti keçir. – Qasım bəydə tacirlik damarı daha qüvvətli idi.* A.Şaiq. *Qarı bu səsi daha dərindən dinləmək üçün gözlərini yumdu.* Ə.Məmmədxanlı. *Əşrəf daha böyük bir maraqla təqibə girişdi.* S.Rəhman. // Bəzən “da” ədatı ilə işlənərək, əvvəlki mənanı qüvvətləndirir. *Şəhərimiz daha da gözəlləşmişdir. – Bu anda daha da bərk uğuldayan quyudan palçıqla qarışıq daşlar fəvvarə vurdu.* M.Hüseyn. [Zeynal] *bilirdi ki, Mehribanı təqib edəcək olsa, onu daha da əsəbiləşdirər.* Ə.Məmmədxanlı.

2. Miqdar və ya vaxt əlavəsini bildirir. *Daha bir saat gözləyin. Qatarın yola düşməsinə daha bir-iki dəqiqə qalmışdır.*

3. Əlavə bildirir: başqa, digər, üstəlik, yenə. *Bir dəfə daha. Daha nə var? Daha vardırmı? Daha yoxdur. – Ortalıqda .. daha başqa yeməli şeylər vardır.* Ə.Əbülhəsən. // Bundan artıq, bundan ziyadə, bundan qeyri. *Daha heç nə istəmirəm. Sənə daha nə lazımdır? Daha nə kimi şeylər var? – Mən daha danışmadım.* M.S.Ordubadi. *Lakin adamlar Mingəçevirdə Qafarın daha bir işini xatırlayırlar*. Ə.Sadıq.

4. Bir şeyin baş vermiş olduğunu, yaxud olub bitdiyini bildirir; artıq. *..Qəhrəman Nübar qarının evində daha hörmətdən düşürdü.* S.Rəhimov. [Hava] *yarım saat əvvəl çox gözəl idi, indi daha külək qalxmışdır.* M.Hüseyn. // İnkar cümləsində: bundan sonra, bundan belə, artıq. *Daha belə işlər görmə. Daha oraya getmə. Daha ağlama. Daha o bizim evdə yaşamır.* // Eyni mənada bəzən “bir” sözü ilə bərabər işlənir. *Bir daha gözümə görünmə. –* [Qız] *mənə bir daha görünmək istəmirdi.* S.Hüseyn.

5. *Hələ* [Şərifə] *daha çocuqkən anasını itirmişdi.* S.Hüseyn. ☐ **Daha doğrusu** – b a x **doğru**[1].

**DAHAN** b a x **dəhan**. *Ləblərin şəhdü şəkər; Dahanın bal kimidi.* (Bayatı). *Dolaşır dahanda söhbətim, sözüm; Mənmi qocalmışam, ya zəmanəmi?* “Koroğlu”.

**DAHİ** [*ər.*] 1. *is.* Xariqülada ağıl və zəkaya malik olan şəxs. *Azadeyi-küdurət idi səhni-asiman; Dahilərin xəyalı kimi təbdar idi.* M.Hadi. *Dahilər – hər sözü bir dağ, bir qala; Cahillər – dağıtmaq, yıxmaq “dahisi”.* M.Araz. // Sif. mənasında. *Dahi rəhbər. Dahi sənətkar. Dahi yazıçı. Dahi kompozitor. – Görürəm dalğındır bu dahi şair; Elə bil canlıdır onun nəfəsi.* S.Vurğun.

2. B a x **dahiyanə**. *İndi hər vətəndaş düşünsün dərin; Gəlsin xatirinə dahi sözlərin.* S.Vurğun.

**DAHİCƏSİNƏ** *zərf* Dahiyə xas olan xariqüladə zəka ilə, istedadla, yaradıcılıqla.

**DAHİLİK** *is.* Dahiyə xas olan ağıl və zəka; düha. *Nizaminin dahiliyi. – Birdən qəfil yada gəlsə: Dahilik! İçimdən bir səda gəlsə: Dahilik! .. Tanrım, məni məndən qoru bu yaşda.* M.Araz.

**DAHİYANƏ** *sif.* [*ər.* dahi və *fars.* ...anə] Dahicəsinə, dahiyə xas olan, ancaq dahinin yarada biləcəyi. *Dahiyanə fikir. – Yüksək, pak və təmiz bir eşq ifadə edən Füzulinin dahiyanə fəlsəfi sənət əsərlərində bəzən bir kədər, acı bir faciə duyulur.* M.İbrahimov.

**DAXAL** *is. məh*. Qarğıdan, qamışdan düzəldilmiş daxma.

**DAXALÇA** *is. məh*. Kiçik daxal.

**DAXIL** *is.* 1. Mağaza, dükan və s.-də pulların yığıldığı yeşik, sandıqça; kassa. *Daxılda nə qədər pul var? Pulu daxıla qoymaq. – Puldan da yana qəti cavab verdi ki, .. indi daxılında doqquz manat tapılar..* C.Məmmədquluzadə. *Mahmud daxılın üstündəki qamçını gördüsə də, buna heç bir məna vermədi.* M.Hüseyn.

2. İçinə xırda pul toplamaq üçün dəmirdən, gipsdən və s.-dən düzəldilmiş, üzərində pul salmaq üçün deşiyi olan kiçik qutu və s.

**DAXILDAR** *is. köhn.* Kassir. *Pulları daxıldara tapşırmaq.*

**DAXILDARLIQ** *is. köhn.* Daxıldarın işi, vəzifəsi; kassirlik.

**DAXİL** *is.* [*ər.*] İçəri, iç tərəf, bir şeyin içərisi. *Bu evin daxili xaricindən gözəldir. Binanın daxili.* // Hər ölkənin öz torpağı, öz hüdudlarının içərisi (*xaric* müqabili). *Daxildə sərf olunan mallar.* – [Daxildə] *düşmənlərlə mübarizəyə başlamadan əvvəl sərhədləri bərkitmək lazımdır.* M.S.Ordubadi. ◻ **Daxil etmək** – bir şeyin tərkibinə, içərisinə, sırasına salmaq, keçirmək. *Adını siyahıya daxil etmək. Müqaviləyə yeni maddə daxil etmək.* – [Qəmərbanu] *..bu yolla onu* [Gülnazı] *istədiyinə razı salacağını, alverini etdiyi xanımlarının cərgəsinə daxil edəcəyini düşünürdü.* M.İbrahimov. ◻ **Daxil olmaq** – 1) girmək. *Bir az keçəndən sonra Sona anası ilə bərabər içəri daxil oldular.* N.Nərimanov. *Kürkə bürünmüş, başı başlıqlı Şəhabəddin içəri daxil oldu.* S.S.Axundov; 2) başlamaq, girmək. *Qış daxil oldu. – Bahar fəsli təzəcə daxil olmuşdu.* Ə.Haqverdiyev; 3) bir təşkilata, cəmiyyətə və s.-yə üzv olmaq. *Həmkarlar ittifaqına daxil olmaq. Dərnəyə daxil olmaq;* 4) təhsil almaq üçün hər hansı təhsil müəssisəsinə qəbul olunmaq. *Kursa daxil olmaq. Universitetə daxil olmaq.* – [Aleksey Osipoviç:] *Şuşa rus-tatar məktəbində səksən nəfər oxuyur, onlardan on üç nəfəri bizim məktəbə daxil olmaq üçün ərizə yazıb.* İ.Şıxlı; 5) bir şeyin tərkib hissələrini təşkil etmək. *Dərmanın tərkibinə daxil olan maddələr. Bitki məhsullarının tərkibinə daxil olan kimyəvi maddələr.*

**DAXİLƏN** *zərf* [*ər.*] 1. İç tərəfdən, daxildən.

2. Öz daxilində, öz-özlüyündə, öz təbiətinə görə; təbiətən. *Novruzəli və usta Zeynallar daxilən çox təmiz və xoşniyyət adamlardır.* M.İbrahimov. // Öz ürəyində, qəlbən. [İmran] *Qadını, yaxud kişini tez-tez dəyişmək insanı daxilən çürüdür, hətta bəzən məhv edir. Məhz buna görə də evlənərkən çox düşünməli, ilk təəssürata əsir olmamalısan.* İ.Şıxlı.

**DAXİLİ** *sif.* [*ər.*] 1. Daxilə, içəriyə aid və mənsub olan (*zahiri, xarici* ziddi). // Bir şeyin daxilində, iç tərəfində olan; içə, daxilə aid olan; iç. *Daxili müqavimət. Daxili əlamətlər. Daxili xüsusiyyətlər. Qabın daxili divarları. Daxili tərəf. – Əşrəf atasının daxili bir ağrıdan qovrulan adamlar kimi sinəsini məhəccərə söykəyib, bir az da büzüşdüyünü hiss etdi.* İ.Şıxlı.

2. Bir dövlətin, idarənin, təşkilatın və s.-nin öz daxilindəki həyat və fəaliyyətinə aid olan (*xarici* ziddi). *Daxili siyasət. Daxili bazar. Daxili vəziyyət. Daxili intizam qaydaları. Daxili ehtiyat vəsaiti. Özgənin daxili işlərinə qarışmaq.*

3. İnsanın psixi fəaliyyətinə aid olan, insanın psixikasında baş verən; dəruni. *Daxili hiss. Daxili narahatlıq. Daxili həyəcan keçirmək. – Xanlar danışdıqca elə bil hamının üzgözü xəfif, daxili bir ziya ilə işıqlanırdı.* M.Hüseyn. *Qaraş həmişə, hətta Naznazın yanında belə, Salmana daxili bir nifrət duyurdu.* M.İbrahimov.

◊ **Daxili dəftər** – bir idarəyə və s.-yə daxil olan kağızları, sənədləri, pul və s.-ni qeydə almaq üçün dəftər. *Bütün kağızlar daxili dəftərə salınmış, sıra nömrəsi və tarixi həmin sənədin kənarında açıq və aydın xətlə yazılmışdı.* S.Rəhimov. **Daxili xəstəliklər** *tib.* – bədənin içərisində baş verən xəstəliklər. *Daxili xəstəliklər mütəxəssisi.* **Daxili sekresiya** *fiziol.* – orqanizmlərin bəzi vəzilərinin bilavasitə qana və limfaya öz maddələrini ifraz etmək xassəsi.

**DAXİLİYYƏ** *sif.* [*ər.*] *köhn.* Bir ölkənin daxilinə aid olan. *Daxiliyyə nazirliyi.*

**DAXMA** *is.* 1. Daşdan, palçıqdan və s.-dən tikilən təkotaqlı, balaca, alçaq, ibtidai ev. *Yazıq muzdur daxmanın ortasında ah-zar ilə özünü yerə vurub ağlamağa başladı.* S.M.Qənizadə. *Sitarənin daldalanmağa bir yeri yox idi, atası evinə də getməyə qorxurdu. Bunun üçün qarşısına gələn xaraba bir daxmaya soxuldu.* Çəmənzəminli.

2. Yer altında düzəldilmiş müvəqqəti, ya daimi ibtidai mənzil; dam. *Qarovulçu kvadratşəkilli bir taxta ilə yeraltı daxmanın qapısını bağlayır.* M.İbrahimov. ◻ **Qara daxma** – pəncərəsiz, qaranlıq daxma. *Nə işıltı, nə də*

*çıraq, nə bir qara daxma var; Hər yer bütün yiyəsizlik, hər yer bütün qalın qar.* A.Səhhət.

3. Ümumiyyətlə, ev, mənzil mənasında (bəzən istehza ilə, ya zarafatla deyilir). *Öz daxmanda otur. Daxmamıza gedək.*

◊ **Daxma qaraltmaq** – yaşamaq üçün ev-eşik düzəltmək və içində yaşayış qurmaq.

**DAXMACIQ** "Daxma"dan *kiç. Yox! Bəlkə də bu torpaqdan daxmacıqda sən; Bir kitabça vərəqləyib məni anırsan?!* S.Vurğun.

**DAİM(A)** *zərf* [*ər.*] Həmişə, hər vaxt, müttəsil, arasıkəsilmədən. *Daim işləmək. Daim artmaq. Daim oxumaq. – Sordum ki, rəqib ilə oturmaq nədir, ey şux? Güldü, dedi: gül daim olur xar yanında.* S.Ə.Şirvani. *Könül bir quşdur ki, sevməz əsarət; Daim çırpınır, istəyir hürriyyət.* A.Səhhət. *Dünyada istedad, hər böyük hünər; Daima vərdişlə inkişaf edər.* A.Şaiq. *Çünki bəşər daima uçduqca uçmaq istər; Hər gün yeni və məchul bir qapı açmaq istər.* M.Müşfiq.

**DAİMİ** *sif.* [*ər*] 1. Uzunmüddətli, uzun müddət üçün olan, müvəqqəti olmayan, sürəkli. *Qatarların daimi cədvəli. Daimi iş. Daimi körpü. – Mədəniyyət uğrunda çalışmaq birgünlük, biraylıq kampaniya deyil, daimi işdir.* Ə.Sadıq. // Əbədi, ölməz, həmişəlik, yoxolmaz, məhvolmaz. *Daimi deyilik nə siz, nə də mən; Bizdən bu dünyada hünər qalacaq.* S.Vurğun.

2. Həmişəlik, əbədi, sabit, möhkəm, dəyişməz. *Xalqlar arasında daimi sülh və əmniyyət.*

3. Ardıcıl, arası kəsilməyən, arasıkəsilməz, həmişə davam edən və ya etdirilən. *Daimi məşq.* ☐ **Daimi cərəyan** *elektr.* – həmişə eyni istiqamətdə nəql olunan cərəyan. **Daimi kapital** *iqt.* – kapitalın istehsal vasitələrinə (xammal, köməkçi materiallar, əmək vasitələri) çevrilən və istehsal prosesində dəyəri dəyişməz (sabit) qalan hissəsi. **Daimi kəmiyyət** *riyaz.* – dəyişən kəmiyyətdən fərqli olaraq, ancaq bir qiyməti olan kəmiyyət. **Daimi ordu (qoşun)** – sülh dövründə saxlanılan ordu (qoşun).

**DAİMİLƏŞDİRİLMƏK** *məch.* Daimi edilmək, daimi hala salınmaq; sabitləşdirilmək.

**DAİMİLƏŞDİRMƏ** "Daimiləşdirmək"dən *f.is.*

**DAİMİLƏŞDİRMƏK** *məch.* Daimi hala salınmaq; sabitləşdirmək.

**DAİMİLƏŞMƏ** "Daimiləşmək"dən *f.is.*

**DAİMİLƏŞMƏK** *f.* Daimi olmaq, daimi hal almaq, əbədi olmaq, sabitləşmək.

**DAİMİLİK** *is.* Daimi olma, həmişəlik, müttəsillik; sabitlik, dəyişməzlik, ardıcıllıq. [Həsənin] *Dilaraya olan sevgisi həmişə bir əbədilik, daimilik hissi ilə bağlı idi.* M.İbrahimov.

**DAİR** *qoş.* [*ər.*] Haqqında, barəsində, xüsusunda, aid, əlaqədar (adətən yönlük halda olan isimdən sonra gəlir). *Avropa üləmalarının övrət məsələsinə dair yazılarını oxuyanda görürsən ki, bu zalımlar dünyanın hər bir guşəsindən xəbər verirlər.* C.Məmmədquluzadə. *Bəlkə Tahirin ali təhsil almadığına dair deyilən sözlər nə məqsədlə isə uydurulmuş sadəcə bir bəhanə idi?* M.Hüseyn.

**DAİRƏ** *is.* [*ər*] 1. Bütün nöqtələri mərkəz nöqtədən bərabər uzaqlıqda olan qapalı, əyri həndəsi fiqur; çevrə. *Dairə cızmaq. Dairə xətti.*

2. *riyaz*. Həmin çevrənin daxilində qalan yuvarlaq səth. *Dairənin səthi.* // Həmin şəkildə olan sahə, səth və s. *Dairə şəklində balaca bostanın dövrəsini bürümüş gül-çiçək elə uzaqdan da qızarışırdı.* M.Hüseyn. ☐ **Dairə salmaq** – dairə şəkli almaq, girdələnmək. *Ay dairə salıb.* **Dairə vurmaq** – 1) dairə şəklində yığılmaq, düzülmək, dövrə vurmaq; 2) *məc*. az rəqs etmək, oynamaq.

3. Respublika, rayon, şəhər və b. sözlərdən sonra gələrək, həmin inzibati bölgünün bütün sahəsi mənasında işlənir. *Respublika dairəsində. Rayon dairəsində. Şəhər dairəsindən çıxmaq.*

4. Bir şeyin yayıldığı və təsir etdiyi sahə. *Nüfuz dairəsi. – Dənizdən əsən soyuq dekabr küləyi alovu üfürdükcə yanğının dairəsi genişlənirdi.* M.Hüseyn. *Parovozlar isə təhlükəli dairədən qatarları çəkərək uzağa apardılar.* Ə.Sadıq. // *məc*. Hüdud, çərçivə. *Özünə verilən tapşırıq və səlahiyyət dairəsində ondan iş tələb etməliyik.* M.S.Ordubadi.

5. Mühit, fəaliyyət sahəsi. *Bizim əqidəmizə görə, müəllimin ürəyində atəş olsa, bu maneələrin çoxuna qalib gələ bilər və öz dairəsində əvvəlinci şəxs ola bilər.* F.Köçərli.

6. Dövlət sahəsinin inzibati, siyasi, təsərrüfat, hərbi və s. nöqteyi-nəzərindən bölgüsü. *Seçki dairəsi. Hərbi dairə.*

7. *tar*. 1917-ci il inqilabından qabaq və inqilabın ilk illərində inzibati-ərazi bölgüsü; rayon. *Bu şəxs Ağdam dairəsində olur.* Ə.Haqverdiyev. *Balaxanı-Sabunçu dairəsindəki dəmiryol qatarı yenə adəti üzrə yubanmışdı.* M.S.Ordubadi.

8. *tar*. Bəzi idarələrin adı. *Məhkəmə dairəsi. Gömrük dairəsi. – Şəhərin əyan və nücəbası, sərkərdələr və yüksək vəzifədə olanlar dəstə-dəstə hökumət dairəsinə gəlib Sultan Toğrulu salamladılar..* M.S.Ordubadi.

9. Girdə şəkildə olan şeylərin ətrafı. *Ayın dairəsi. Quyunun dairəsi.*

10. *məc*. Yalnız cəm şəklində – hər hansı bir ictimai, ya həmkarlar qrupu, mühiti. *Ədəbi dairələr. Ziyalı dairələri.*

11. *tib*. Orqanizmin ayrıca hissəsi, bədənin hər hansı bir nahiyəsi. *Ürək dairəsində ağrı. Döş dairəsi.*

**DAİRƏCİK** *is*. Kiçik dairə. *Yağışdan göldə əmələ gələn dairəciklər. İşıqlı dairəciklər.* – [Cahandar ağanın] *qulaqları güyüldədi, gözlərinin qabağında qara dairəciklər oynadı.* İ.Şıxlı.

**DAİRƏLƏNMƏ** "Dairələnmək"dən *f.is*.

**DAİRƏLƏNMƏK** *f*. Dairə kimi olmaq, dairəvi olmaq, dairə şəkli almaq, dəyirmi olmaq; girdələnmək. *Günəş dairələnib yerindən çıxır, üfüq mis rəngi alır.* S.Rəhimov.

**DAİRƏVARİ** *sif*. Dairə kimi, dairəyə oxşar, dairə şəkilli.

**DAİRƏVİ** *sif*. [*ər*.] Dairə şəklində olan; dəyirmi, girdə. *Mehmanxanada ilk nəzərə dəyən birinci mərtəbədəki böyük dairəvi dəhlizin bir neçə yerdən şırım-şırım sal şüşəsidir.* M.İbrahimov.

**DAİRƏVİLİK** *is*. Dairəvi şeyin halı; dəyirmilik, girdəlik.

**DAQQA** *is*. *məh*. 1. Dəridən tikilmiş hündür papaq. *Şiraslan .. daqqa divan papağını başına qoydu, üfürülüb evdən çıxdı.* S.Rəhimov.

2. Taxıl və b. səpələnən şeyləri ölçmək üçün dəmirdən qayrılmış dəyirmi qab. *Daqqa ilə buğda ölçmək.* // İçində taxıl və s. saxlamaq üçün qab.

**DAQQAQARIN** *sif. dan*. Qarnı daqqa kimi qabağa çıxmış (adam); yekəqarın.

**DAL**[1] *is*. 1. Bədənin boyundan tutmuş omba sümüyünə qədər olan arxa hissəsi; kürək. *Küçə ilə bir hambal, bir tay dalında keçir.* C.Məmmədquluzadə. // Heyvanların bədənlərinin yuxarı hissəsi, beli. *Qatırın dalına yük yükləmək. Atın dalına minmək.*

2. Əks tərəf, bir şeyin geri tərəfi, qarşı tərəf. *Xavər taxtanın dalında gizlətdiyi şəkli gətirib uşağa verdi.* M.İbrahimov. *Sədr stolun dalında oturmuşdu.* Ə.Vəliyev. *Ayaz atın ayağı altında qalmamaq üçün güclə özünü ağac dalına verə bildi.* Ə.Məmmədxanlı.

3. *sif*. Dal tərəfdə olan. *Dal cərgə. Dal otaq. – ..Həbib bəy hirslə dayandı və dal sırada oturmuş yekə bir oğlana acıqlandı.* S.Rəhman.

4. *məc*. Aqibət, son, nəticə. *O, siyasi işə hərgiz də qarışmaz, çünki; Özü çox yaxşı bilir ki, bu işin dalı nədir.* M.Ə.Sabir. // Ard, mabəd, gerisi, dalısı. *Dalı gəlir. Dalı var. – Kəndə çatdığı üçün İkram söhbətin dalını eşidə bilmədi.* Ə.Əbülhəsən.

5. Geri. *Həsən kişi Qulunun qolundan tutub dala* (z.) *qayıtdı.* M.İbrahimov. □ **Dal ayaq(lar)** – dördayaqlı heyvanların dal tərəfdəki iki ayağı. *At fınxırıb iki dal ayaqlarının üstə göyə qalxdı.* "Koroğlu".

◊ **Dal çevirmək** – məqsədinə çatdıqdan sonra bir şeydən qaçmaq, üz döndərmək, nankorluq etmək. *Yoldaşa dal çevirmək.* – [Ceyran:] *..Mənim ərim vətənə dal çevirməyib.* Ə.Əbülhəsən. **Dal gün** – sonra ola biləcək çətin vaxt, pis gün, ağır gün. *Həmişə çay kötük gətirməyəcək. Dal günə bir şey at.* Ə.Əbülhəsən. **Dala (dalı) düşmək** – bax **dala qalmaq**. *Mülki-cahanda, Seyyida, xatəmi-aşiqan mənəm; Nöqteyi-əvvələm, vəli növbədə dalə düşmüşəm.* S.Ə.Şirvani. *Osmanlıların ümumən dalı düşməsinə .. üç səbəb var; ikisi bizə əyandır, amma biri Allahın yanındadır.* C.Məmmədquluzadə. **Dala atmaq** – 1) geri qalmağa səbəb olmaq, geriyə atmaq, gecikdirmək, ləngitmək. *Xəstəlik onun işini xeyli dala atdı*; 2) *məc*. qənaət edib saxlamaq, yığmaq, gələcək üçün ayırıb saxlamaq (pul və s.). **Dala baxmadan** – üzünü dala çevirmədən, birbaşa,

tez, sürətlə. *İndi o yüyürür dala baxmadan; Bayaq yüyürmürdü, o sürünürdü.* B.Vahabzadə. **Dala çəkilmək** – 1) geri çəkilmək. *Fazil dala çəkilib əlini gözlərinin üstünə qoydu..* Ə.Haqverdiyev; 2) sözünün üstündə durmamaq. *Ballı peşmançılıqla dala çəkildi.* Ə.Əbülhəsən. **Dala durmaq** – 1) iştirak etməkdən boyun qaçırmaq, özünü kənara çəkmək, iştirak etməmək; 2) sözünü geri almaq. **Dala getmək** – 1) getdikcə zəifləmək, pisləşmək, düşkünləşmək. *Xəstələnib, gün-gündən dala gedir*; 2) bax **dala qalmaq**. **Dala götürmək (sözünü, vədini)** – geri almaq, geri götürmək. **Dala qalmaq** – geridə qalmaq, irəli getməmək, inkişaf etməmək. *Amma nə edəsən ki, dala qalmışıq.* M.S.Ordubadi. **Dalda demək (danışmaq)** – birinin dalınca, özü olmadığı halda haqqında söz demək, qeybətini etmək. **Dalda qalmaq** – geridə qalmaq. **Dalda qoymaq** – geridə buraxmaq, ötmək, ötüb keçmək. **Dalı kəsilməmək (üzülməmək)** – ardı kəsilməmək, bitməmək, qurtarmamaq. *Qoşunun dalı üzülmürdü.* **Dalına almaq** – aparmaq üçün öz arxasına qoymaq. **Dalına çatmaq** – aparmaq üçün dalına yığmaq, yükləmək. **Dalına düşmək** – 1) təqib etmək, ardınca düşmək. [Şamama Cadu:] *Bu gündən düşərəm onun dalına.* Ə.Haqverdiyev; 2) əldə etməyə çalışmaq, bir şeyin qeydinə qalmaq, tədarük etmək. *Yağdan sonra düyü tədarükünün dalına düşürlər, çünki plov düyüsüz olmaz.* C.Məmmədquluzadə. **Dalına minmək** *məc.*– özünə tabe etmək, istədiyini etdirmək. **Dalına vermək** – 1) aparmaq üçün şeyləri birisinin dalına yükləmək. *..Qoca kəndli arabadan taxıl kisələrini fəhlələrin dalına verirdi, onlar da anbarlara yığırdılar.* S.S.Axundov; 2) *məc. dan.* birini qızışdırmaq, yaxud bir şeyi boynuna qoymaq üçün onu yalandan tərifləmək. *Dedi pişik: – Vermə mənim dalıma; Çünki bələdsən mənim əhvalıma.* S.Ə.Şirvani. **Dalına-qabağına baxmaq** – ehtiyatlı olmaq, hər tərəfi yoxlamaq, öyrənmək, götür-qoy etmək. **Dalında durmaq** – kömək etməyə hazır olmaq, himayə etmək, müdafiə etmək. **Dalını dağa söykəmək** – bir şeyə və ya bir adama arxayın olmaq, heç bir şeydən qorxmamaq. **Dalını yerə vermək** – məğlub olmaq, basılmaq, təslim olmaq. **Dalını-qabağını düşünmək (fikirləşmək)** – bax **dalına-qabağına baxmaq**. *Biz müsəlman tayfası bir sözü danışanda heç o sözün dalını-qabağını fikirləşmirik.* C.Məmmədquluzadə.

**DAL²** *is. şair.* Ağacın ilk şaxəsi, böyük budağı; ümumiyyətlə, budaq. *Yanağı laləsən, qaməti dalsan; Ağzı şəkər, dili-dodağı balsan.* M.P.Vaqif. *Təbiət bəzənərdi xələt geyib çiçəkdən; Dallar yarpaq açardı atlaz kimi ipəkdən.* M.Rahim.

**DAL³** *sif.* [*ər.*] Ərəb əlifbasındakı د ("d") hərfinin adı. // *məc.* Həmin hərf kimi əyri, bükülü, bükülmüş (adətən klassiklərdə və aşıqların dilində). □ **(Əlif) qəddi (beli) dal olmaq** – beli bükülmək, əyilmək. *Başım üstə qanım içən cəlladım; Sağ əlində əlif qəddim dal oldu.* Qurbani. *Həsrətindən əlif qəddi dal olub; Mat qalıbdır, şirin dili lal olub.* M.P.Vaqif.

**DALAB** *is. məh.* Dəvə, at və bəzi başqa heyvanlarda oyanan cinsi əlaqə həvəsi. *Atların dalab vaxtı. Dalaba durmaq* (gəlmək).

**DALAQ** *is. anat.* Qarın boşluğunun sol tərəfində olub qan kürəcikləri hazırlayan və bu proseslə bağlı başqa mürəkkəb vəzifələr görən bədən üzvü.

◊ **Dalağı sancmaq** – şübhələnmək, qorxmaq. *İndi belə, Əsgər Saçlıya bərk bənd olduğu vaxt yenə də dalağı ancaq Sübhanverdizadə tərəfindən sancırdı.* S.Rəhimov.

**DALAMA** "Dalamaq"dan *f.is.*

**DALAMAQ** *f.* 1. Ətə toxunub gicitmək, yandırmaq. *Gicitkən əlimi daladı. Yun corab ayağımı dalayır. – Atanın üzündəki neştər kimi tüklər balacanın üzünü daladığı üçün yuxudan ayıldı.* Ə.Vəliyev.

2. Qapmaq, dişləmək (quduz heyvanlar haqqında). *Quduz canavar kimi dalamaq. – Qurdumuz quduzdur, dalar; Şahinimiz durna ovlar.* "Koroğlu". *Bir qaydadır, qaçaq-quldur otlaqları talayır; Quduz itlər ötüb-keçən yolçuları dalayır.* O.Sarıvəlli.

3. Sancmaq. *Taxtabiti dalayır.*

4. *məc.* Acı söz söyləmək, sancmaq, acıtmaq (bəzən "qudurmuş it kimi" sözləri ilə). [Hacı Fərəc:] *Sən bilmirsən, Güldəstə, o arvad qudurmuş it kimi məni dalayır.* N.Vəzirov.

◊ **Yan-yörəsini dalamaq** – hamını sancmaq, acılamaq, söymək, təhqir etmək. [Mollabacı Hürzada:] *Paxıllıqdan qudurmuş itə dönüb yan-yörəni dalayırsan.* Çəmənzəminli.

**DALAN** *is*. 1. Küçə qapısından həyətə gedən üstüörtülü və ya açıq yol. [Hacı Fərəc:] *Bundan sonra dalanın qapısı həmişə gərək bağlı ola..* N.Vəzirov. [Məşədi Əsgər] *yavaş-yavaş qapıya sarı gedib, şüşədən dalana baxmaq istəyirdi ki, birdən qapı açıldı.* S.M.Qənizadə. *Küçə qapısından girərkən uzun, qaranlıq bir dalanı keçib öz otağıma gedərdim.* S.Hüseyn.

2. İki qonşu ev arasında olan və bir tərəfi həyət qapısına çıxan dar yol. *Dalanın nömrəsi. – Küçələrin tini, dar keçidlər, meydançalar və dalanların hamısında kazaklar durmuşdu.* M.S.Ordubadi. *İçərişəhərdə, qaranlıq dar bir dalanda kiçik bir otaq tutub anamla yoxsul həyat keçirirdik.* A.Şaiq.

3. Evin, vaqonun və s.-nin girəcəyində açıq, ya örtülü dar yer. *O, papiros çəkən adamlardan çətinliklə ötdü, vaqonun dalanında dayandı.* Mir Cəlal.

**DALANDAR** *is.* Evin həyətinə baxan; həyəti, küçəni süpürən xidmətçi, süpürgəçi. *O günün sabahı dalandarı yanıma çağırıb, gördüyüm qadın barəsində məlumat istədim.* S.Hüseyn. *Qaşqabaqlı, qara, ortaboy dalandar gözünü yumub, başı ilə rədd edirdi..* Mir Cəlal.

**DALANDARLIQ** *is.* Dalandarın işi, vəzifəsi. *Dalandarlıq etmək. – Həyətlərində neçə ildən bəri dalandarlıq edən bu kişinin ona xeyli yaxşılığı dəymişdi.* M.Hüseyn.

**DALANMA** "Dalanmaq"dan *f.is.*

**DALANMAQ** "Dalamaq"dan *məch*. *Ətim dalandı.*

**DALAŞDIRILMA** "Dalaşdırılmaq"dan *f.is.*

**DALAŞDIRILMAQ** *məch*. Bir-biri ilə vuruşdurulmaq, aralarına dava salınmaq.

**DALAŞDIRMA** "Dalaşdırmaq"dan *f.is.*

**DALAŞDIRMAQ** *f.* Vuruşdurmaq, vuruşmalarına səbəb olmaq. *Uşaqları dalaşdırmaq*.

**DALAŞQAN** *sif.* Dalaşmağı, savaşmağı çox sevən, daim dalaşan, boğuşan; çox davakar. *Dalaşqan uşaq. – Mahmud uşaqlıq dövründə olduğu kimi daha nadinc və dalaşqan deyildir.* P.Makulu.

**DALAŞQANLIQ** *is.* Dalaşqan adamın xasiyyəti; savaşqanlıq, davakarlıq, boğuşqanlıq.

**DALAŞMA** "Dalaşmaq"dan *f.is. Xanpəri ilə Mədədin dalaşma hadisəsi Gülşənin ürəyini bərk əzdi.* Ə.Vəliyev.

**DALAŞMAQ** *qarş.* Savaşmaq, vuruşmaq, dava eləmək. *Uşaqlar dalaşırlar.* // Küsüşmək, sözləşmək, söyüşmək, bir-birinə ağır sözlər demək. [Nurəddin:] *Baba, daha Gülpəri ilə dalaşma, mən razıyam.* S.S.Axundov. [Müdir:] *Adam evdə əsəbiləşə bilər, .. bəlkə dalaşar da, fəqət dörd-beş illik bir ailə həyatını pozmaz*. S.Hüseyn.

**DALAYAN** *f.sif.* Ətə dəyəndə yandıran, gicişdirən. *Dalayan ot.*

**DALAY-DALAY** *is.* Xanəndələrin oxumağa başlarkən əvvəlcə giriş kimi söylədikləri söz.

**DALAYICI** *sif.* Dalayan.

**DALAY-LAMA** [*monq.*] Tibetdə dini və dünyəvi hakim; Tibet-monqol buddistlərinin baş ruhanisi.

**DALBADAL** *zərf* Bir-birinin dalınca, bir-birinin ardınca; ardıcıl, peydərpey. *Dalbadal axışıb gəlmək. Dalbadal papiros çəkmək. – Dəvə, maya, nər, köşək; Lökləyirlər dalbadal.* A.Səhhət. [Cabbar bəy] *on beş il bundan qabaq evlənmiş və dalbadal beş uşağı olmuşdu.* S.Rəhman. *Bütün sədd boyu dalbadal atılan tüfənglərin arası kəsilmir.* M.Rzaquluzadə. // Arası kəsilmədən, ara vermədən; fasiləsiz. *Dalbadal öskürmək.*

**DALDA** 1. *sif.* Sığınmağa və ya gizlənməyə yarayan. *Dalda yer. Dalda divar. – Kosa boşalmış küçənin dalda yeri ilə yeriyib at tövlələrinin yanına çatdı.* S.Rəhimov. *Aqil onu güclə ağaclar arasına, dalda bir yerə gətirdi.* Mir Cəlal.

2. *is.* Qorunmağa, sığınmağa yarayan yer; sığınacaq, təhlükəsiz yer. *Namərd adam dava günündə qaçar; Gedər daldalarda pəhləvan olar.* "Koroğlu". [Mahmud:] *Bəy də beş-on nökərləri ilə bir daldaya girib camaatla atışır*. Ə.Haqverdiyev. // Gizli yer, xəlvət. *Əgər yarsan, gəl sarmaşaq qol-boyun; Durub daldalardan baxmağın nədir?* M.P.Vaqif. *Oğrun-oğrun daldalardan baxırsan; Alırsan cəsəddən canı, sevdiyim!* Aşıq Ələsgər.

3. *is. məc*. Kömək, arxa, himayə. *Daldası olan adam. – Mərd igidlər bir-birinə daldadı.* "Koroğlu". *Əzizim daldasına; Mərd igid daldasına; Namərd aslan olsa da; Sığınma daldasına.* (Bayatı).

**DALDA-BUCAQDA** *is*. Xəlvət, gözə görünməyən yer, göz qabağında olmayan yer. *Dalda-bucaqda gizlənən və keçmişin xəyalı ilə yaşayanları kəskin tənqid atəşinə tuturdu.* S.S.Axundov.

**DAL-DALA** *zərf* Dallarını dallarına çevirərək. ☐ **Dal-dala vermək** – bir-birinə arxalanmaq, bir-birinə kömək etmək. *Verdilər dal-dala o heyvanlar; Qıldılar buynuzlarilə cövlanlar.* S.Ə.Şirvani.

**DALDALAMA** "Daldalamaq"dan *f.is.*

**DALDALAMAQ** *f.* Bir şeyin dalına çəkmək, gizlətmək. [Dursun:] *Evə getməyin. Gəlin, mən sizi daldalaram.* C.Cabbarlı. *Zamanov pəncərədən baxdıqca, Əsgər çəkilir və başını daldalayırdı.* S.Rəhimov.

**DALDALANACAQ** *is.* Daldalanmağa yarar yer, dalda yer, sığınacaq; bir şeydən qorunmaq üçün yer. *Nəriman hər şeydən əvvəl özünə daldalanacaq axtarırdı.* Mir Cəlal. // Sif. mənasında. *Burada heç daldalanacaq yer yoxdur. – Məktəbin geri yanında evlərdən kilim gətirib daldalanacaq düzəltdilər.* İ.Şıxlı.

**DALDALANDIRMA** "Daldalandırmaq"dan *f.is.*

**DALDALANDIRMAQ** *f.* Dalda yerdə sığındırmaq, dalda yerə çəkmək; himayə etmək.

**DALDALANMA** "Daldalanmaq"dan *f.is.*

**DALDALANMAQ** *f.* 1. Dalda bir yerə sığınmaq, çəkilmək, pənah aparmaq. *Sitarənin daldalanmağa bir yeri yox idi, atası evinə də getməyə qorxurdu.* Çəmənzəminli. [Qadın] *..daldalanmaq üçün bir bucaq, sığınacaq axtarır.* Ə.Məmmədxanlı. // Özünü bir şeyin təsirindən qorumaq üçün bir yerə çəkilmək. *Ağacın altında daldalanmaq.*

2. *məc*. Gizlənmək. *Qapının dalında daldalanmaq. – Camalın görəndə daldalanır ay.* Q.Zakir.

**DALDALANMALI** *sif.* Daldalanmağa yarayan, sığınmağa yarayan. *Kənddən iki verst uzaqdakı qamışlıq daldalanmalı yer idi.* Mir Cəlal.

**DALDALATMA** "Daldalatmaq"dan *f.is.*

**DALDALATMAQ** *f.* Daldada sığındırmaq, dalda yerə çəkmək.

**DALDALAYICI** *sif.* Qoruyan, sığındıran, saxlayan, himayə edən, daldalanmağa yarayan. *Yağışdan daldalayıcı çardaq*.

**DALDALI** *zərf* Üzünü dala çevirmədən, dala doğru. *Daldalı getmək. – Pişik miyovuldaya-miyovuldaya uşağın dalicə daldalı hərəkət edirdi.* C.Məmmədquluzadə. *Sərvər daldalı gedib Sənəmi gətirir.* Ü.Hacıbəyov.

**DALDALIQ** 1. B a x **daldalanmalı**.

2. *is.* Dalda yer; dalda. *Daldalıqda oturub günəşin batmasını gözlədik.*

**DALDAN** *zərf* 1. Dal tərəfdən, arxa tərəfdən, arxadan. *Daldan atılan daş topuğa dəyər.* (Məsəl). *Cəftəylə bağladı daldan qapını; Bucaqdan götürdü nöyütqabını.* M.Rahim.

2. Dalınca, arxasınca. *Çöl qapıdan mən çıxanda müdir yoldaş məni daldan çağırdı.* C.Məmmədquluzadə.

**DALDEY** *məh*. b a x **dalda** 1 və 2-ci mənalarda. *Əkbər də onun dalınca gedirdi. Daldey bir yerdə dayandılar.* Mir Cəlal.

**DALDIRMA** "Daldırmaq"dan *f.is.*

**DALDIRMAQ** *icb*. 1. Dalmağa məcbur etmək, dalmasına səbəb, ya vasitə olmaq. *Fikrə daldırmaq*. – *Baxınız, qaç yeni buruğun seyrinə; Daldırmış bizləri...* M.Müşfiq.

2. Suyun, mayenin içinə girməyə, batmağa məcbur etmək.

**DALĞA** *is.* 1. Su səthinin hərəkəti nəticəsində əmələ gələn böyük ləpə. *Dənizdə dalğa var. Köpüklü dalğalar. – Qabağındakı daşlara toxunan dalğaların hər birisi bir timsah şəklini aldı.* M.S.Ordubadi. *Burada dalğalar qayığı atıb-tutur, gah sağa, gah da sola tərəf dəyirdi*. M.Hüseyn.

2. *fiz*. Fiziki mühitdə titrəyişli hərəkət (çox vaxt cəm şəklində işlənir). *Səs dalğaları. Elektromaqnit dalğaları. Radio dalğaları. İşıq dalğaları. Hər bir cisim temperaturundan asılı olaraq, müxtəlif uzunluqda dalğası olan şüa buraxır*.

3. *məc*. Hərəkətdə olan kütlə, camaat, izdiham, axın mənasında. *İnsan dalğası.*

**dalğa-dalğa** *zərf* Dalğalar halında, ardıkəsilməz axın halında, axın-axın, birbirinin ardınca. *O xoşbəxt gecənin o xoşbəxt*

*səsi; Axıb dalğa-dalğa yayıldı köyə*. S.Vurğun. *İşıq gəlir dalğa-dalğa; Sonsuz Muğan torpağına.* M.Rahim.

**DALĞACIQ** *is.* Kiçik dalğa, ləpə. *Dənizin üzündəki dalğacıqlar. – Ayın kəsik şüaları sakit-sakit ləpələnən dənizdə əks etdikcə, dalğacıqlar gümüş pullar kimi parıldayırdı.* M.Hüseyn.

**DALĞADÖYƏN** b a x **ləpədöyən**.

**DALĞAKƏSƏN** *is. xüs*. Gəminin burnu, dalğanı yaran hissəsi.

**DALĞAQIRAN** *is. xüs*. Limanı dalğa təsirindən qorumaq üçün bənd. *Bəzən fırtına dalğaları körpüləri, betondan tökülmüş dalğaqıranları sındırır*.

**DALĞALANDIRILMA** "Dalğalandırılmaq"dan *f.is.*

**DALĞALANDIRILMAQ** *məch*. 1. Dalğalanmasına səbəb olmaq; ləpələndirilmək. // Yelləndirilmək, tərpədilmək.

2. *məc*. Həyəcana gətirilmək, hərəkətə gətirilmək.

**DALĞALANDIRMA** "Dalğalandırmaq"-dan *f.is.*

**DALĞALANDIRMAQ** *f.* 1. Dalğalı hala salmaq, dalğa kimi tərpətmək, ləpələndirmək. *Suyu dalğalandırmaq. Dənizi dalğalandırmaq. – Vıyıldayan şiddətli külək pambıq kollarını dalğalandırırdı...* M.Hüseyn. // Yelləndirmək, tərpətmək. *Külək bayraqları dalğalandırır.*

2. *məc*. Həyəcana gətirmək, hərəkətə gətirmək. *İnqilab kütlələri dalğalandırdığı bir gündə, çay yenə də sükutunu pozmayır..* M.S.Ordubadi. *Qoca əxinin sinəsi isə sanki bir bulaqdı; o daima qaynayır, o daima şirin xəyalını dalğalandırır.* Ə.Məmmədxanlı.

**DALĞALANMA** "Dalğalanmaq"dan *f.is. Külək gücləndikcə dalğalanma da güclənir.*

**DALĞALANMAQ** *f.* 1. Suyun üzərində dalğa əmələ gəlmək; ləpələnmək, təlatüm etmək. *Dəniz dalğalanır. – Yağlanmış su dalğalandıqca, göy qurşağı kimi rəng verib rəng alırdı*. M.Hüseyn.

2. Küləyin təsiri ilə dalğa kimi tərpənmək, enib-qalxmaq; yellənmək. *Bayraqlar dalğalanır. – Göy yamacın ətəyində, kəndciyəz; Dörd yanında dalğalanır tarlalar.* A.Şaiq.

3. *məc*. Hərəkətə gəlmək, həyəcana gəlmək, coşmaq. *Dalğalandı Sabirlərin ümman dünyası..* B.Vahabzadə. *İnsan nərəsindən, yerin səsindən; Dalğalanır Bakı, çalxanır Xəzər.* S.Vurğun.

**DALĞALATMA** "Dalğalatmaq"dan *f.is.*

**DALĞALATMAQ** b a x **dalğalandırmaq**.

**DALĞALI** *sif.* 1. Dalğası olan, ləpələnən, dalğalanan; təlatümlü. *Dalğalı dəniz.*

2. Dalğa şəklində görünən, dalğaya oxşayan, dalğavari. *O yanda Puşkinin heykəlinə bax! Dalğalı saçları ağarmış qarla.* S.Vurğun.

**DALĞAÖLÇƏN** *is. xüs*. Dalğanın hərəkət və şiddətini ölçmək və hesablamaq üçün cihaz.

**DALĞASINDIRAN** b a x **dalğaqıran**.

**DALĞASIZ** *sif.* Dalğa olmayan, ləpəsiz, sakit. *Dalğasız dəniz. – Mədəndə dalğasız mazut gölləri; Açır qoxusilə dar könülləri.* M.Müşfiq.

**DALĞASIZLIQ** *is*. Ləpəsizlik, sakitlik. *Dənizin dalğasızlığı.*

**DALĞAVARİ** *sif.* Dalğayaoxşar, dalğayabənzər, dalğa kimi, əyri-üyrü, qalxıb-enən. *Dalğavari xətt. Dalğavari duman. Dalğavari səth. Dalğavari saç. –* [Bəhmənin] *..saçları əvvəlki təkin sıx, dalğavari idi.* İ.Məlikzadə. // Dalğalar şəklində hərəkət edən. *Dalğavari hərəkət*.

**DALĞAVURAN** b a x **ləpədöyən**.

**DALĞAYABƏNZƏR** b a x **dalğavari**.

**DALĞAYABƏNZƏRLİK** b a x **dalğayaoxşarlıq**.

**DALĞAYAOXŞAR** b a x **dalğavari**.

**DALĞAYAOXŞARLIQ** *is.* Dalğayaoxşar şeyin halı.

**DALĞAYARAN** b a x **dalğaqıran**.

**DALĞIC** *is. xüs*. Su keçirməyən xüsusi paltarla suyun altına dalıb orada iş görən peşəkar işçi. *Dalğıclar dənizin dibinə düşdülər.* ◻ **Dalğıc gəmisi** – *sualtı texniki işlər görmək üçün gəmi.*

**DALĞICLIQ** *is. xüs*. Dalğıcın işi, peşəsi, sənəti.

**DALĞIN** *sif.* Dərin fikrə batmış, çox fikirli, fikri bir şeylə məşğul. [Qızın] *yüksəkcə boyu, ağ bənizi, uzaqlarda bir şey arayan dalğın gözləri diqqətimi cəlb etmişdi.* S.Hüseyn. // Zərf mənasında. *Bir saat əvvəl*

*sakit və dalğın bir tövr ilə bir yerdə büzülüb duran bu qoca artıq nəzərimizdə böyümüşdü.* A.Şaiq. *Nə mənalar oxuyuram dalğın baxan o gözlərdə.* S.Vurğun.

**DALĞIN-DALĞIN** *zərf* Çox fikirli halda. *Dalğın-dalğın yerimək. Dalğın-dalğın baxmaq.*

**DALĞINLAŞMA** "Dalğınlaşmaq"dan *f.is.*

**DALĞINLAŞMAQ** *f.* Dalğın olmaq, dərin fikirlərlə məşğul olmaq, çox fikirli olmaq. *..Kefi saz olan Şirzad bir az dalğınlaşdı.* M.İbrahimov. *Tutularaq kədərə; Dalğınlaşır dağ, dərə.* M.Müşfiq.

**DALĞINLIQ** *is.* Dalğın hal, fikirlilik. *İri, qara gözlərinə bir duman; gülər, saf çöhrəsinə bir dalğınlıq çökmüşdü.* A.Şaiq. *Kölgə düşmüş əsmər üzə o dalğınlıq çox yaraşır.* M.Dilbazi.

**DALI** b a x **dal**[1] 5-ci mənada. *Yeriyəndə dönüb dalı baxmağı; Ahunun balası səndən öyrənib.* Q.Zakir.

**DALI-DALI** b a x **dal-dalı**. *Adəti üzrə məni dalı-dalı aparıb qoltuqlu sandaliyada oturtdu.* M.S.Ordubadi. [Tulalar] *ikisi də başlarını kolun içinə soxdular. Sonra dalı-dalı çəkilməyə başladılar.* S.S.Axundov. *Onlardan biri dalı-dalı çəkilir, o birisi isə qabağındakının üstünə ildırım kimi şığıyırdı.* M.Hüseyn.

**DALINCA** *zərf* 1. Ardınca, arxasınca, izincə; izləyərək, təqib edərək. *Bir-birinin dalınca getmək. Dalımca gəl. – Kərbəlayı Cəfər əmi qabaqca və Xudayar onun dalınca gedib girdilər bir xırda qaranlıq hücrəyə.* C.Məmmədquluzadə. *Ülkərin dalınca Aygün də qalxdı; Əmirxan bu dəfə Əlyara baxdı.* S.Vurğun.

2. Bilavasitə sonra, ardınca, ara vermədən. *Birinci atəşin dalınca ikincisi eşidildi. Kitabı kitab dalınca oxuyur. Papirosu papiros dalınca çəkir.*

3. Məqsəd bildirir. *Həkim dalınca adam göndərmək.* – [Student] *sevincli bir halda qulluqçunu çağırdı, xanımın yanına kitab dalınca göndərdi.* Çəmənzəminli. *Hüseynqulu ağa Qaraca qızın dalınca nökər göndərdi ki, gəlib oynasın.* S.S.Axundov.

**DALISI** 1. B a x **dal**[1] 4-cü mənada. *Lakin camaatın dalısı üzülmürdü.* Mir Cəlal.

2. Arxası, dalı. *Zeynəb bacı* [Məcidi] *dalısına alıb evlərinə apardı.* M.S.Ordubadi. *Uşağın dalısında, deyəsən, odun şələsi vardı.* Mir Cəlal.

**DALISINCA** *zərf* Dalınca, ardınca, arxasınca. *Qəfil bir sevgini dağdan qolayla; Sonra dalısınca ağla, deyiblər.* M.Araz.

**DAL-QABAQ** *zərf* Dal tərəfi qabağa çevrilmiş halda, bir-birinin ardınca. *Arxada isə, .. bir-biri ilə yanaşı yox, bir-birindən dal-qabaq, birinci və ikinci dağcığaz vardı.* Ə.Əbülhəsən.

◊ **Dalqabaq vurmaq** – yerində olmamaq, tez-tez yerini dəyişmək, gah dalda, gah qabaqda olmaq. *..Sizin o orucluq ayları, qurban ayları ildə azı 10 gün dalqabaq vurur.* Mir Cəlal.

**DALQƏLSƏMƏLİLƏR** *is. zool.* Onurğasız, yumşaqbədənli heyvanların (molyuskların) bir cinsi.

**DALLI** *sif.* Dalları (budaqları) olan. *Dallı ağac.*

**DALLI-BUDAQLI** *sif.* Çoxlu budağı olan, qollu-budaqlı. *Dallı-budaqlı ağac.*

**DALLIQ** *is.* Söykənəcək, bir şeyin söykənmək üçün olan hissəsi. *Stulun dallığı. Kürsünün dallığı.*

**DALMA** "Dalmaq"dan *f.is.*

**DALMAQ** *f.* 1. Görünməyəcək dərəcədə suyun içinə girmək, batmaq. *Suya dalmaq. – Dəryalara mən dalanda; Şirin cana dərd salanda; Dava zamanı olanda; Əyilməz, sınmaz dəmirəm.* "Koroğlu". // Məc. mənada. *Saçın kimi qıvrılan dalğalara dalaydım; Dalıb ilham alaydım.* M.Müşfiq. // *məc.* Bir şeyin içində qərq olmaq. *Qaranlığa dalmış şəhərə baxırdılar.* Ə.Məmmədxanlı.

2. *məc.* Özünü unutmaq dərəcəsində bir şeylə dərindən məşğul olmaq, bir şeyə başı qızışmaq (adətən, "fikrə", "xəyala", "sükuta", "yuxuya" və s. sözlərə qoşularaq işlənir). *Fikrə dalmaq. Sükuta dalmaq. – Bu gözəl mənzərənin seyrinə dalmaqdan isə; Daha xoşdur, gedib öz dərdimə dərman etsəm.* A.Səhhət. [İsmət:] *Keçən gecə bir xeyli fikrə daldım; Düşündüm, düşündüm, uyqusuz qaldım.* H.Cavid.

**DALTÓNİK** [*xüs.is.*-dən] Daltonizmi olan adam.

**DALTONÍZM** [ingilis fiziki Daltonun adından] Rəngləri (çox vaxt qırmızı ilə göyü) seçə bilməməkdən ibarət göz qüsuru.

**DAM**[1] *is.* 1. Ev, bina, tikili. *Şəhərin dar küçələri, sıx həyətləri, qaranlıq damları onları təmin etmədi.* Mir Cəlal. // Əsas binanın yanında tikilmiş və ona yapışıq otaq və s. *Şərəfnisə xanım ikinci damda ahəstə ağlaya-ağlaya yun darayır.* M.F.Axundzadə. ☐ **Qara dam** – bacası tavanının ortasında olduğu üçün daim hisli olan, pəncərəsiz, ibtidai ev; daxma. *Kənddəki evlərin hamısı torpağın altında tikilmiş qara damlardan ibarət idi.* İ.Əfəndiyev. *Bütün kənd təkbacalı qara damlarda, ya ömründə gün üzü görməyən qabağı səkili tövlələrdə yaşayırdı.* S.Rəhimov.

2. Evin, binanın, tikilinin örtüsü. *Dama çıxmaq. Damdan yağış dammaq. Kirəmit dam. Damı qırlamaq. – Biz eyvanda və damın üstündə vaxtımızı keçirirdik.* C.Məmmədquluzadə. *Hündür evlərin damlarını ağappaq qar örtmüşdü.* M.İbrahimov. *Adamlar damın üstündə gecələyirdilər.* Ə.Məmmədxanlı.

3. Bir, ya iki tərəfi açıq, üstüörtülü yer, tikili. [Əsgər bəy:] *A kişi, indi bu dumanda, çiskində kazaklar tamam dam altına yığışıblar.* M.F.Axundzadə.

4. Heyvanları saxlamaq üçün qapalı yer; bina, tövlə. *Komandan ilə Musa mal damına yanaşdılar.* M.Hüseyn. *Qoyun, quzu, dana, xötək; Mal-qara dolur dama.* B.Vahabzadə.

5. *məc.* Həbsxana, qazamat. ☐ **Dama basmaq (qatmaq, salmaq)** – həbs etmək, həbsə salmaq. *Xülasə, qəzetləri bağlamaqda və yazıçılarını dama qatmaqda mən hökuməti haqlı tutmuram.* C.Məmmədquluzadə. **Dama girmək** – həbs edilmək, həbsə alınmaq. [Kərəmov:] *Olmaz da, pulları yemisən, üstündən su da içmisən. İndi dama girəndə ağlın başına gələr.* S.Rəhman.

◊ **Bir dam(ın) altında** – bir yerdə, bir evdə, bir mənzildə, bərabər, yanaşı. *İndi bu adam* [Zeynal] *onunla bir dam altında bərabər yaşamaq istəməyirdi.* S.Hüseyn. *O zaman bir damın altında birləşən iki qəlbin bəxtiyarlığı məni qorxudurdu.* İ.Əfəndiyev.

**DAM**[2] *is.* [*fars.*] *klas.* Tələ, cələ, tor. *Zülfünü əhli-vəfa seydinə dam eyləyəli; Məni ol damə giriftar bilibdir, bilirəm.* Füzuli. ☐ **Dam qurmaq** – tələ qurmaq, hiylə düzəltmək. *Xalqa bunlar hamı qurublar dam; Bir bunu anlamaz bu qövmi-avam.* S.Ə.Şirvani.

**DAMA** *is.* 1. Şahmat taxtası üzərində qara və ağ daşlarla (dairəciklərlə) oynanılan oyun; şaşka. *Dama oynamaq. Dama oyunu üzrə yarış.*

2. Bu oyunda rəqibin, ilk sıradakı xanalardan birinə gedib çıxmış daşı.

3. Səth, parça və s. bölündüyü kvadratlardan biri. *Parça üzərindəki damalar.*

**DAMACIQ** *is.* Xırda dama, kiçik kvadrat.

**DAMACIQLI** *sif.* Kiçik damaları olan.

**DAMAD** *is.* [*fars.*] Qızın əri, kürəkən, giyov. *Çünki Fərəc xan Bağır xanın əmisi oğlu və damadıdır, heç bir əmrdə onun rəyinə müxalifət etməz.* M.F.Axundzadə. *Lakin ixtiyar bir şair öz damadına, öz övladına qarşı bu cür rüsvayçılıq yaradarsa, buna nə ad qoya bilərik?* M.S.Ordubadi. *Qızı çoxdan gətirmişdilər. Damad hələ gəlib çıxmamışdı.* A.Şaiq.

**DAMA-DAMA** 1. *sif.* Üzərində damalar, yaxud dama şəklində cızıqlar olan. *Dama-dama parça. Dama-dama dəftər.*

2. B a x **dama** 1-ci mənada.

**DAMADLIQ** *is.* Kürəkənlik, giyovluq.

**DAMAQ**[1] *is.* 1. Ağız boşluğunun üst tərəfi. ☐ **Damaq səsi** *dilç.* – tələffüz edərkən dilin damağa toxunması nəticəsində çıxan səs. *Damaq saitləri*.

2. Ağız mənasında. *Usta papirosu damağına salıb başladı işini.* C.Məmmədquluzadə. *Qüdrət iri barmaqları arasındakı papirosu sakit-sakit övkələyib damağına qoydu.* M.Hüseyn.

3. *bayt*. At və eşşəkdə damaq şişmə xəstəliyi; kəsmə. *Tez-tez tövləyə adam buraxma ki, at damaq olar*. Ə.Vəliyev.

**DAMAQ**[2] *is.* [*ər.* dimaq – beyin] *dan*. Kef, əhval, həvəs. *Damağı yoxdur*.

◊ **Damağı çağ** – b a x **damağı kök**. *Əhmədin kefi saz, damağı çağdır.* Mir Cəlal. *Dedim: – Cütçü baba, sağ ol, çox sağ ol! Daima kefi kök, damağı çağ ol!* S.Vurğun. *Yamaclar gülür bu yaz; Damağın çağ, kefin saz.* O.Sarıvəlli. **Damağı çağ olmaq** – kefi kök olmaq, çox şad olmaq. **Damağı çatlamaq** – nəşəyə gəlmək, ruhlanmaq, ruhu yüksəlmək.

**Damağı çəkmək** – ürəyi istəmək, kefi istəmək, kefinə gəlmək. *Bu gün damağım çəkdi, aldım, sabah kefim istədi, boşadım, – vəssalam!* C.Məmmədquluzadə. **Damağı gəlmək** – həvəsə gəlmək, həvəslənmək. *Siz bunu sanmayın həqiqətdir; Damağım gəldi, bir zərafətdir*. M.Ə.Sabir. **Damağı kök** – kefi kök, kefi saz, şad, qayğısız. **Damağı qalxmaq** – kefi kök olmaq, nəşələnmək, sevinmək, həvəsə gəlmək. **Damağı pozulmaq** – kefi xarab olmaq, əhvalı pozulmaq, qanı qaralmaq. **Damağı sazlaşmaq** – kefi açılmaq, könlü açılmaq. [Onun] *bulud kimi tutulmuş qaşqabağı açıldı, gözləri gülüb damağı sazlaşdı.* "Kirpi". **Damağı yanmaq** – arzusuna çatmamaq, məyus olmaq. **Damağına dəymək** – toxunmaq, ürəyini sındırmaq, küsdürmək, pərt etmək, incik salmaq. **Damağını pozmaq** – kefini xarab etmək, əhvalını pozmaq. **Damağını sallamaq** – küsmək, pərt olmaq, narazı qalmaq. *Bütün qonaqlar damaqlarını salladılar.* Ə.Vəliyev. **Damaq qoymaq (etmək)** – nəşəsini pozmaq, arzusunu (həsrətini) ürəyində qoymaq. *Qovurmanın iyi Yəhya Kamalı damaq etmişdi.* Mir Cəlal. **Damaq sallamaq** – bikef olmaq, əhvalı olmamaq, dilxor olmaq; küsmək, incimək. *Damağını niyə sallayırsan? Barmağından üzüyünü, başından yaylığını aparmayıb ki?!* S.Rəhimov. **Damaq üstə (damaqda) olmaq** – kefdə olmaq, kef çəkmək, xoş güzəran keçirmək. [Şahbaz bəy:] *Arvad al, qoy evdə evdarlıq etsin, sən də kefdə, damaqda ol.* S.S.Axundov. [Səkinə qarı:] *Həmişə damaqda olasan, ay Züleyxa!* M.İbrahimov. **Damaq vermək** – ləzzət vermək, nəşə vermək, kef vermək, nəşələndirmək. **Damaqdan düşmək** – ruhdan düşmək, kefi pozulmaq, pərt olmaq. **Damaqdan salmaq** – pərt etmək, kefini pozmaq, ruhdan salmaq, qanını qaraltmaq. [Qərib:] *Mən gedirdim, dostum çıxdı qabaqdan; Acı sözün salmaz məni damaqdan.* "Aşıq Qərib".

**DAMAQARXASI** *sif. dilç*. Damaq arxasında tələffüz edilən. *Damaqarxası səs.*

**DAMAQLANMA** "Damaqlanmaq"dan *f.is.*

**DAMAQLANMAQ** *f.* Kef çəkmək, keflənmək, nəşələnmək. *İrandan gedənlər və İrana gedənlər damaqlanmaq üçün bu restoranda bir yerə yığılmışdı.* M.S.Ordubadi.

**DAMAQLI** *sif.* Zarafatçı, məzəli, əhvallı, kefcil, həmişə şən, xoştəbiət, xoşsöhbət, xoşəhval. *Bizə tərəf gələn bir faytonda bir damaqlı oğlan, yanında başına minarə boyda şlyapa qoymuş sarısaçlı qız yanımdan yel kimi ötdü.* Ə.Haqverdiyev. *..Tanış faytonçumuz var, ancaq bu gün xəstədir. Bir damaqlı oğlandır.* Mir Cəlal.

**DAMAQLILIQ** *is.* Damaqlı olma, kefcillik, xoştəbiətlilik, əhvallılıq.

**DAMAQORTASI** *sif. dilç*. Damaq ortasında tələffüz edilən. *Damaqortası samit.*

**DAMAQÖNÜ** *sif. dilç*. Damaq önündə tələffüz edilən. *Damaqönü səs*.

**DAMAQSIZ** *sif. dan*. Kefi pozuq, nəşəsiz, küskün.

**DAMAQSIZLIQ** *is*. *dan*. Damağı olmama, kefsizlik, bikeflik, küskünlük.

**DAMALAMA** "Damalamaq"dan *f.is.*

**DAMALAMAQ** *f.* Parça və s.-nin üstünə dama şəklində naxışlar vurmaq; dama-dama etmək. *Kəlağayını damalamaq. Baş şalını damalamaq.*

**DAMALANMA** "Damalanmaq"dan *f.is*.

**DAMALANMAQ** *məch*. Üzərinə damalar şəklində naxış vurulmaq; dama-dama edilmək.

**DAMALI** *sif.* Üzərində damalar olan, üzərinə dama şəkli çəkilmiş; dama-dama. *Damalı dəftər. – Bir döyüş meydanıdır üstü damalı taxta.* R.Rza.

**DAMAR** *is.* 1. Canlıların bədənində: içərisində qan və ya limfanın dövr etdiyi boruşəkilli orqan. *Qan damarları. Damarları şişmək. Alnının damarları görünür.* □ **Damar sistemi** *anat*. – canlının bədənində olan bütün damarlar. *Damar sistemi maye toxuma* (*qan və ya limfa*) *cərəyan edən boru sisteminə deyilir.* K.Balakişiyev.

2. Çeşmənin mənşəyi, başlanğıcı. *Dağ ətəyində bir çeşmə vardır, özü aranda da olsa, damarı dağdan gəlir*. S.Rəhimov.

3. Süxurda, ağacda və s.-də zolaq şəklində təbəqə; lay. *Faydalı qazıntıların bəziləri böyük kütlələr şəklində, bəziləri ayrı-ayrı damarlar, səpələnti və sairə şəklində tapılır.* M.Qaşqay. // Yarpaqlarda cizgi şəklində izlər.

4. *məc*. Xüsusiyyət, həvəs, təmayül, qabiliyyət, bacarıq mənasında. *Quluda alver-*

*çilik damarı vardı.* A.Şaiq. // *məc.* Hiss, duyğu mənasında. *Onların da milliyyət hissi və qeyrət damarı ayılıbdırmı?* F.Köçərli.

◊ **Damarı tutmaq** – tərslik etmək, inad etmək, şıltaq etmək. *Onun gahdanbir damarı tutur. Yenə damarı tutubdur.* **Damarına düşmək** – xoşuna gəlmək, ürəyinə yatmaq. *Bu hava adamın damarına düşür.* – [Ağsaqqal:] *A bala, höcət eləməyin, görmürsünüzmü tərs damarına düşüb?!* İ.Şıxlı. **Damarını tapmaq** – xasiyyətini, zəif yerini, ürəyini öyrənib bilmək. *Necə ki haman adam da sənin damarını tapdı, ruhunu oxşadı və özünə bağladı.* M.S.Ordubadi. **Damarını tutmaq** – 1) öyrənmək, mahiyyətini bilmək, uyğunlaşmaq. [Qüdrət:] *Aslan .. həyatın damarını tuta bilmir və ona görə də həyatdan geridə qalır, onunla ayaqlaşa bilmir.* M.Arif; 2) b a x **damarını tapmaq**. **Damarları qurumaq** – qorxudan, dəhşətdən donub qalmaq, bərk qorxmaq. *Biçarə muzdurun damarları qurudu ki, indicə yaranalın buyruğu ilə Həsənəli bəy onu tutub qazamata göndərəcəkdir.* S.M.Qənizadə. **Şah damar** – 1) qanı ürəyə axıdan damar; 2) *məc*. bir şeyin əsası, mərkəzi, canı. *Sanki yaralanmışdı yerlərin şah damarı.* R.Rza.

**DAMARALTI** *sif. anat.* Damarın altında olan. *Damaraltı ət.*

**DAMARAOXŞAR** *sif.* Damara oxşayan, damar şəklində olan, damar kimi.

**DAMARAOXŞARLIQ** *is.* Damara oxşama, damara oxşayan şeyin hal və görünüşü.

**DAMARCIQ** *is.* Kiçik damar, incə damar, nazik damar. *Alnın damarcıqları. – Hər bir yarpağın şah damarı olur və bu damardan xırda damarcıqlar ayrılır.* "Pambıqçılıq".

**DAMARCIQLI** *sif.* Çoxlu damarcıqları olan.

**DAMAR-DAMAR** *sif.* Damarlar, zolaqlar şəklində olan. *Göy üzü damar-damar; Ay baxar xumar-xumar; Ürək ki var, şüşədir; Sındırarsan, kim yamar?* (Bayatı). // Çoxlu damarlar şəklində. *Çəkirlər əllərimi qupquru damar-damar; Eh, uzunsaç rəssamlar, yelayaq fotoqraflar!* S.Rüstəm.

**DAMARIBOŞ** *sif. dan.* İradəsiz, zəif iradəli, səbatsız, tez aldanan, tez yoldan çıxan, tez təsir altına düşən. *Damarıboş adam.* // Qeyrətsiz, namussuz.

**DAMARIBOŞLUQ** *is. dan.* İradəsizlik, səbatsızlıq, tez başdan çıxma, tez təsirə düşmə xasiyyəti. // Qeyrətsizlik, namussuzluq.

**DAMARIQIRIQ** b a x **damarıboş**.

**DAMARLAMA** "Damarlamaq"dan *f.is*.

**DAMARLAMAQ** *f.* Damarından yapışmaq, sıxmaq, boğmaq. *Fəssad olub da, milləti daim damarladın; Hər kəs əlindəkin yerə atdı, qamarladın.* M.Ə.Sabir.

**DAMARLANMA** "Damarlanmaq"dan *f.is.*

**DAMARLANMAQ** *f.* Damar-damar olmaq, damarlar (zolaqlar) əmələ gəlmək.

**DAMARLI** *sif.* 1. Çoxlu damarı olan. *Damarlı ət.*

2. Xəstəlik, arıqlıq, qocalıq və s. nəticəsində dərisinin üstündə damarları görünən. *Əmiraslan baba damarlı əlini qar kimi ağappaq saqqalına çəkir, uzun bığlarını tumarlayırdı.* S.Rəhimov.

3. *məc. dan.* Namuslu, qeyrətli, iradəli, sözünün üstündə duran. *Övladları qeyrətlidir, damarlı; Şücaətli, hünərli, etibarlı.* A.Səhhət. [Lütfəli bəy:] *..Yəni bu mənim xoşuma gəlir, çünki bu gün-sabah bu mənim arvadım olacaq, hələ mənə də belə damarlı, namuslu arvad gərək.* İ.Musabəyov. *..Ürəyində öz-özünə* [dedi:] – *Yox, balam, deyəsən, bu, damarlı adam olacaq!* Ə.Əbülhəsən.

**DAMARLILIQ** *is. dan.* 1. Damarlı şeyin halı.

2. *məc.* Namusluluq, qeyrətlilik. // İradəlilik, möhkəmlik, səbatlılıq.

**DAMARSIZ** *sif. dan.* 1. Damarı olmayan.

2. *məc.* İradəsiz, zəif iradəli, sözünün üstündə durmayan. *Damarsız adam.*

3. *məc.* Namussuz, qeyrətsiz.

**DAMARSIZLIQ** *is. dan.* 1. İradəsizlik, zəiflik, səbatsızlıq.

2. *məc.* Namussuzluq, qeyrətsizlik.

**DAMARÜSTÜ** *sif. anat.* Damarın üstündə olan; damarı örtən. *Damarüstü dəri.*

**DAMAZLIQ** *sif.* Döl verməyə yarayan, döl vermək üçün saxlanılan; döllük, cins. *Damazlıq qoyun. Damazlıq buğa. – Azərbaycan atları damazlıq bir cins kimi, Orta və Yaxın Şərq ölkələrinə, hətta Hindistan və*

*Misirə belə aparılmışdır.* R.Səttarzadə. // İs. mənasında. *Damazlığını yeyən tamarzı qalar.* (Ata. sözü). *Damazlıq olaraq Hökümənin atası onlara bir inək də vermişdi.* S.Hüseyn. ☐ **Damazlığı kəsilmək** – nəsli kəsilmək. **Damazlığın kəsilsin** – qarğış ifadəsi. *Buy, sənin damazlığın kəsilsin!* S.Rəhimov. **Damazlıq stansiyası** *k.t.* – damazlıq işi ilə məşğul olan heyvandarlıq müəssisəsi. *Ağdaş rayonunda barama qurdu zavodu və baramaçılıq üzrə damazlıq stansiyası vardır.* (Qəzetlərdən).

**DAMBA** [*holl.*] *xüs*. Alçaq yerləri su basmaqdan qorumaq, sututarlarda isə suyu saxlamaq və s. üçün düzəldilən hidrotexniki qurğu; bənd. // Üzərində yol salmaq üçün suda düzəldilən uzun sədd. *Həmin damba sahili ayrı-ayrı dəniz buruqları ilə birləşdirəcəkdir.* (Qəzetlərdən).

**DAMBAT** *sif. məh*. Lovğa, mütəkəbbir, özünü bəyənən, ədabaz. *Dambat adam.*

**DAMBATLAŞMAQ** *f. məh*. Təşəxxüslənmək, özünü başqalarından yuxarı tutmaq, təkəbbürlü olmaq.

**DAMBATLIQ** *is. məh*. Lovğalıq, mütəkəbbirlik, ədabazlıq, təşəxxüs. *Dambatlığı sevməmək.* ☐ **Dambatlıq satmaq** – təşəxxüs satmaq, lovğalıq etmək.

**DAMBİTİ** *is. zool*. Taxtabitiyə oxşar parazit cücü.

**DAMCI** *is.* 1. Su və bu kimi mayelərin girdə şəklə düşmüş ayrıca kiçik hissəciyi. *Su damcısı. Tər damcıları. – Sıçrayarkən işıldayır damcılar; San saçılar mirvaridlər, incilər.* A.Səhhət. *Damcılar günün qabağında almaz kimi parıldayırdı.* A.Divanbəyoğlu.

2. *tib*. Damcılarla içilən dərman. *Damcı reseptləri də məhlul və miksturaların reseptləri kimi yazılır.* R.Əliyev.

3. "Bir" sözü ilə – çox az miqdar, çox cüzi, bir zərrə. *Bir damcı çörək yeyib qalxdım. – Bir damcı dürr tufanların yaratdığı coşqun sellərdən daha dəyərlidir.* M.S.Ordubadi.

◊ **Dənizdə bir damcı** – lazım olduğu miqdara nisbətən heç dərəcəsində, yox dərəcəsində olan şey haqqında.

**damcı-damcı** *zərf* Damcı halında, damla-damla; az-az, azca-azca. *Damcı-damcı axmaq. – Qan damcı-damcı tökülüb, otları və çiçəkləri lalə rənginə döndərmişdi.* S.S.Axundov. *Yağış damcı-damcı yağır; Göz yaşları yanaqdan damcı-damcı axır.* R.Rza. *Böyük bir dağın ətəyində bir kiçicik bulaq vardır; Damcı-damcı axıb gedir, o, keçmişdən yadigardır.* Z.Xəlil.

**DAMCICIQ** *is.* Kiçik damcı. ☐ **Bir damcıcıq** – bir az, azacıq, lap cüzi. *Can qardaşım! Görsə gözüm bir damcıcıq saf qanını; Min şairin qüvvətilə yazacağam dastanını.* S.Vurğun.

**DAMCILAMA** "Damcılamaq"dan *f.is.*

**DAMCILAMAQ** *f.* Damcı-damcı tökülmək, sızmaq. *Əlüzyuyandan su damcılayır. – ..Ələmdar uzun burnunun ucundan damcılayan göz yaşlarını sildi.* S.Rəhimov.

**DAMCILANDIRMA** "Damcılandırmaq"-dan *f.is.*

**DAMCILANDIRMAQ** *f.* Damcı-damcı tökmək; damcılatmaq.

**DAMCILANMA** "Damcılanmaq"dan *f.is.*

**DAMCILANMAQ** *məch*. Damcı-damcı tökülmək (axıdılmaq).

**DAMCILATDIRMA** "Damcılatdırmaq"-dan *f.is.*

**DAMCILATDIRMAQ** *icb*. Damcı-damcı tökdürmək, axıtdırmaq.

**DAMCILATMA** "Damcılatmaq"dan *f.is.*

**DAMCILATMAQ** *f.* Damcı-damcı tökmək, axıtmaq. [Dərmanı] *suya damcılatdıqda suda həll olmayan maddələr çökməyə başlayır.* R.Əliyev.

**DAMCILAYICI** *is. xüs*. Mayeni damcı-damcı tökmək üçün cihaz, alət; pipet.

**DAMCIL-DAMCIL** *zərf* Hissə-hissə, az-az, getdikcə, yavaş-yavaş. *Ana, .. bədənini damcıl-damcıl əridir, uşağını bəsləmək üçün çırpınırdı.* Mir Cəlal.

**DAMCILIQ** *is.* 1. Damcı axmaq üçün damlarda düzəldilən yerlər. *Çardağın damcılığı.*

2. B a x **damcılayıcı**.

**DAMCISALAN** b a x **damcıtökən**.

**DAMCISAYAN** b a x **damcılayıcı**.

**DAMCITÖKƏN** b a x **damcılayıcı**.

**DAMCIVARİ** *sif.* Damcı kimi, damcıya oxşar, damcı şəklində olan.

**DAMDABACA** *is.* 1. Uşaqları qorxutmaq üçün yalandan uydurulmuş mövhum vücud ("dam" və "baca" sözlərindən düzəldilmiş-

dir). *Qorxuzsun o da damdabaca ilə çağasın; Kəssin də sədasın.* M.Ə.Sabir.

2. Kifir, idbar, çirkin, ifritə. *Paçcahın oğlu gördü, ədə, qız damdabacanın biridir.* (Nağıl).

**DAM-DAM** *is. məh*. Doşab bişirmək üçün sıxılıb damcı-damcı yığılan üzüm suyu. *Bulanıq dərman .. Nərimana dam-dam suyunu xatırlatdı.* Mir Cəlal.

**DAMDANDÜŞMƏ** *sif. dan*. Təsadüfi, yersiz, münasibətsiz, mənasız, cəfəng. *Damdandüşmə söz. – Deyirəm: – Ay qardaş, sən Allah, belə damdandüşmə sözlər danışma, xalq eşidib səni məzəmmət elər.* C.Məmmədquluzadə.

**DAM-DAŞ** *is.* Tikili, bina, ev. *Allah dəvəyə qanad versəydi, dam-daş uçurardı.* (Ata. sözü). *Bir neçə müsəlman dam-daş tikdirib bir balaca kənd salıblar.* C.Məmmədquluzadə. *Allahverən dayı cəngəl bürümüş damdaşını göstərdi.* S.Rəhimov.

**DAMDIRMA** "Damdırmaq"dan *f.is.*

**DAMDIRMAQ** b a x **damızdırmaq**.

**DAM-DİVAR** *top*. Ev və divarlar. *Damdandivardan boylanan çantalı uşaqları bəzən adbaad çağırıb içəri salırdı.* Mir Cəlal.

**DAM-DUM** *təql*. Təbil kimi şeylərin hasil etdiyi səs.

**DAMƏN** *is.* [*fars.*] *klas*. Ətək (paltarda). *Tutaram yarın qiyamətdə, həbibim, damənin; Məstsən qəflət şərabından, bu gün möhlət sana*. Füzuli. ☐ **Dağ daməni** – dağ ətəyi. *Utan bir, Koroğlu, utan; Dağların damənin tutan.* "Koroğlu". *Biri dağ damənin tutmuş; Biri səhrayə üz qoymuş.* Q.Zakir.

**DAMƏNƏ** b a x **damən**. *Dağın damənəsində, müzəyyən çəməndə iki çadır qurulubdur.* M.F.Axundzadə.

**DAMĞA** *is.* 1. Atların və başqa heyvanların dərisi üzərinə qızdırılmış dəmirlə vurulan nişan. ☐ **Damğa basmaq (vurmaq)** – bax **damğalamaq** 1-ci mənada. *Çəpərimə girib, – deyə bəy rəiyyətə badalaq gəldi, rəiyyət öküzünün, atının və danasının buduna damğa vurub öz hesabına keçirdi.* S.Rəhimov. // *tar*. Qədim müstəbid dövlətlərdə caninin bədəninə qızdırılmış dəmirlə basılan nişan.

2. Möhür, nişan. *Malın üstündə fabrikin damğası var.*

3. *xüs*. Damğa basmaq üçün alət.

4. *məc*. Ləkələndirici, təhqiredici, alçaldıcı söz və s. ☐ **Damğa basmaq (vurmaq)** *məc*. – ləkələmək, damğalamaq, rüsvay etmək, üstünə böhtan atmaq. **Lənət damğası basmaq** – b a x **lənət**.

**DAMĞABASAN, DAMĞAVURAN** *is.* 1. Damğa vurmaq üçün alət. // Damğa vuran adam.

2. *məc*. Adama cürbəcür ləkələndirici adlar qoyan, qarayaxan şəxs.

**DAMĞAÇI** b a x **damğavuran**.

**DAMĞALAMA** "Damğalamaq"dan *f.is.*

**DAMĞALAMAQ** *f.* 1. Damğa vurmaq, damğa aləti ilə nişan vurmaq, dağ basmaq. [Gülsənəm:] *Ağamın naxırçısı inəyimi damğalayıb bəyin naxırına qatmış.* S.S.Axundov. // Möhür basmaq.

2. *məc*. Rüsvay etmək, iç üzünü açıb göstərmək, ləkələmək.

**DAMĞALANMA** "Damğalanmaq"dan *f.is.*

**DAMĞALANMAQ** *məch*. 1. Damğa basılmaq, damğa vurulmaq, damğa aləti ilə nişan vurulmaq. // Möhür basılmaq.

2. *məc*. Ləkə vurulmaq, rüsvay edilmək.

**DAMĞALANMIŞ** *f.sif.* 1. Damğa vurulmuş, damğa aləti ilə nişan vurulmuş, dağ basılmış. *Səməd sağ yanaqlarından "S" hərfi şəklində damğalanmış qoyunlarını tanıyıb sağmağa başladı.* M.Hüseyn. // Möhür basılmış.

2. *məc*. Ləkələnmiş, ləkə vurulmuş, rüsvay edilmiş.

**DAMĞALATMA** "Damğalatmaq"dan *f.is.*

**DAMĞALATMAQ** *icb*. Damğa vurdurmaq.

**DAMĞALI** *sif.* 1. Damğası olan, dağ basılmış. *..Alnı damğalı adam qulağı damğalı heyvandan pisdir.* S.Rəhimov.

2. *məc*. Ləkəli, üstündə ləkə olan, eyibli, nöqsanlı. [Carçiyev:] *Sən onda səhv eləmisən ki, belə bir damğalı nəsildən özünə dost seçmisən.* İ.Hüseynov.

**DAMĞASIZ** *sif.* 1. Damğası olmayan, damğa vurulmamış.

2. *məc*. Ləkəsiz, ləkə vurulmamış, təmiz.

**DAMIZDIRILMA** "Damızdırılmaq"dan *f.is*.

**DAMIZDIRILMAQ** *məch*. Damcı-damcı tökülmək, damcı-damcı axıdılmaq.

**DAMIZDIRMA** "Damızdırmaq"dan *f.is.*

**DAMIZDIRMAQ** *f.* Damcı-damcı tökmək, damcı-damcı axıtmaq; damızmaq. *Sübhanverdizadə .. firçanı piyalədə hərlədi, bir az su damızdırdı, təkrar firçanı dolandırdı, köpük qalxdı.* S.Rəhimov.

**DAMIZMA** "Damızmaq"dan *f.is.*

**DAMIZMAQ** bax **damızdırmaq**.

**DAMLA** bax **damcı**. *Gecəki yağışdan çiçəklərin, yarpaqların uclarından sallanan damlalar günəşin al şəfəqləri altında almaz dənələri kimi pırıl-pırıl pırıldayır.* A.Şaiq. *Bərkiyən yağışın damlaları Ayazı yerindən tərpətdi.* Ə.Məmmədxanlı. ☐ **Bir damla** – bir damcı (bax **damcı** 3-cü mənada). *Ona elə gəldi ki, bu saysız-hesabsız ülgüclər hər tərəfdən onun boğazına ilişəcək və bir göz qırpımında bir damla qan axmağa belə macal vermədən onun başını üzüb düzə atacaq.* S.Rəhimov. **Son damla qanı qalana kimi** *tənt.* – bir şey uğrunda mübarizədə yüksək fədakarlığı bildirir. *Son damla qanı qalana qədər düşmənlə vuruşmaq.* **Son damlasına qədər** – hamısını, bütünlüklə, dibinəcən. *İskəndər əlindəki qədəhi son damlasına qədər içir.* A.Şaiq. *Ürək yanğısını söndürmək üçün* [Yunis] *suyu son damlasına qədər başına çəkib, ağır bir nəfəs ötürdü.* Mir Cəlal.

**damla-damla** bax **damcı-damcı**. *Əsgər kişi, and da içdin şəhid olmuş o qıza sən; Damla-damla göz yaşları axıtmadın gözlərindən.* S.Vurğun. *Elə bil ağ buluddan damla-damla tökülüb; Hər yanda novruzgülü.* R.Rza.

**DAMLACIQ** *is.* Kiçik damla (damcı).

**DAMLAMAQ[1]** bax **damcılamaq**. *Gözlərindən yaş damlayır.*

**DAMLAMAQ[2]** *f. dan.* Dama salmaq, həbs etmək. *Oğrunu damladılar.* – [İskəndər:] *Ağa!.. Nə buyurursunuz, onları damlayaq, yoxsa danışdıracaqsınız?* N.Vəzirov. *Molla Qəşəm toplanmış pulları da götürüb qaçmağa hazırlaşır. Biz onun adamlarından birini tutub damlamışıq.* M.Hüseyn.

**DAMLANMA** "Damlanmaq"dan *f.is.*

**DAMLANMAQ** *məch. dan.* Dama salınmaq, həbs edilmək. *Əhməd, Xuduşun damlandığını eşidincə, Kamalın yanına məsləhətə getdi.* Ə.Əbülhəsən.

**DAMLATDIRILMA** "Damlatdırılmaq"-dan *f.is.*

**DAMLATDIRILMAQ** *məch. dan.* Dama (həbsə) saldırılmaq; tutdurulmaq.

**DAMLATDIRMA** "Damlatdırmaq"dan *f.is.*

**DAMLATDIRMAQ** *icb. dan.* Dama saldırmaq; tutdurmaq.

**DAMLATMA** "Damlatmaq"dan *f.is.*

**DAMLATMAQ** *icb. dan.* Dama saldırmaq, həbs etdirmək; tutdurmaq.

**DAMMA** "Dammaq"dan *f.is.*

**DAMMAQ** *f.* 1. Damcı-damcı axmaq, düşmək, tökülmək. *Samovarın lüləyindən su dammaq. Ev damır.*

2. *məc.* Tökülmək, axmaq. *Nur dammaq.* – *Danışanda şəkər damar sözündən; Qaymaq dodaqları, ballı sənəm, gəl!* Xəstə Qasım. *Günəş çəkilirdi, artıq axşamdı; Göy ətəklərinə boyalar damdı.* S.Rüstəm.

**dama-dama** bax **damcı-damcı**. *Dama-dama göl olar, dada-dada heç.* (Ata. sözü). *Dama-dama göl olar, qəpik-qəpik yığılıb ağca manat əmələ gələr.* N.Vəzirov.

**DAMOTU** *is. dan.* Qol-budaqlı və üzəri tüklərlə örtülü, təbabətdə işlədilən çoxillik ot bitkisi. [Damotunun] *gövdəsinin üzərində qarşı-qarşıya durmuş və yumşaq tüklərlə örtülmüş tünd-yaşıl rəngli saplaqlı yarpaqları yerləşmişdir.* R.Əliyev.

**DAN** *is.* Günün doğmasına azca qalmış havanın işıqlanması, sabah açılarkən günəşin üfüqdə ilk ağarması. *Dan işığı.* – *Axşamın sirrini dan bilər.* (Ata. sözü). *Sübhün xəbərini gətirəndə dan; Yorğun dost gözləri halsız qapandı.* M.Dilbazi. ☐ **Dan atmaq** – bax **dan yeri ağarmaq**. *Dan atdı, şəfəq sökdü, günəş yaqut tacı ilə firuzə taxtına oturdu.* A.Şaiq. *Səhərlər dan atanda, qıpqırmızı buludlar; Sancılır bu binanın qülləsinə qatarlar.* R.Rza. *Gecə yarı onlar qoşa çox söhbət etdi; Dan atanda qəhrəmanım yuxuya getdi.* M.Rahim. **Dan atmamış** – sübh açılmamış. *Çıxmamış gün, atmamışdan; Qanlı bir toz qalxdı yoldan.* Ə.Cavad. *Tanrının Pərinisası yuxu yatmır, dan atmamış zəmidə .. olur..* Mir Cəlal. *Dan atmamış hər tərəfdən alovlandı sıx meşə.* Ə.Cəmil. **Dan ulduzu** – 1) Zöhrə ulduzu, Venera. *Evində,*

*eşiyində; Yat, quzum, beşiyində; Dan ulduzu, bir də mən; Durmuşuq keşiyində.* (Bayatı). *Xoş meh əsir sərin-sərin; Baxır göydən dan ulduzu.* S.Rüstəm; 2) *məc*. gözələ işarə. *Qaranlıq gecədə səni gözləyib; Durmaqdan yoruldum, ey dan ulduzu!* C.Cabbarlı. [Göyərçin:] *Mən bir ailənin dan ulduzuyam; Atanın, ananın bircə qızıyam.* M.Rahim. **Dan üzü** – dan vaxtı, sübh tezdən, ala-qaranlıq. *Dan üzü idi. Hələ dan ulduzu batmayıb ərşifələkdə öz dövrünü edirdi.* A.Divanbəyoğlu. *Hücum səhər dan üzü başlanmışdı.* Ə.Məmmədxanlı. *Biz hərbiyəlilər dan üzü durmağı öyrənmişik.* Mir Cəlal. **Dan vaxtı** – dan sökülən vaxt, sübh tezdən, gün görünməyə başlayanda, ertədən. *Hər gün dan vaxtı yuxudan duran qardaşların heç biri yataqdan çıxmaq istəmirdi.* Mir Cəlal. **Dan yeli** – səhər küləyi, nəsim. *Dan yeli hər yana ətir dağıdır; Çöllərə çəkilir bir yaşıl pərdə.* A.Şaiq. **Dan yeri** – dan işığının göründüyü yer; üfüq. *Səhərin dan yeridir; Sübh yeri, dan yeridir; Bulaq başı hər axşam; Bir dəstə can yeridir.* (Bayatı). *Görünür dan yeri qıpqırmızı qan rəngində.* S.Rüstəm. *Açılır yuxudan aləmin gözü; Dan yeri can verir yenə insana.* O.Sarıvəlli. *Qızla oğlan fərəh və həyəcan içində qalxıb dan yerində lalə tək qızarmış buludlara baxaraq .. düşünürdülər.* İ.Əfəndiyev. **Dan yeri ağarmaq (açılmaq, qızarmaq, sökülmək)** – sübh açılmağa başlamaq. *Səhər dan yeri ağarmağa başlar-başlamaz mağaradan çıxıb dünən maral ovladığım yerə gəldim.* A.Şaiq. *Qızardı dan yeri, səhər açıldı; Günəş doğdu, dünyaya nur saçıldı.* A.Səhhət. *Gecə öz pərdəsini yığıb gedir, dan yeri sökülür.* M.İbrahimov. **Alt dan** – həqiqi dan sökmə, sabah açılma, sübh. *Alt dan ağaranda muzdur oyanıb durdu, gərnəşib əsnədi.* S.Rəhimov.

**DANA** *sif.* [*fars.*] *klas*. Alim, bilici. *Füzuli, cami-mey tərkin qılıb zöhd ilə təqvadən; Qamu danayə rövşəndir bu kim, nadanlığın vardır.* Füzuli.

**DANA**[1] *is.* Bir yaşdan iki yaşa qədər olan inək balası. *Dana əti. – Danışıq dananı qurda verər.* (Məsəl).

**DANA**[2] *dan.* B a x **dayna**. [Bəbir bəy:] *Hürriyyətlik dediyin nədi? Özümüzük, lap loru deyək, özümüzük, dana!* Mir Cəlal.

**DANAAYAĞI** *is. bot*. Rütubətli meşələrdə bitən iriyarpaqlı çoxillik ot bitkisi.

**DANABAŞ** *is. məh*. 1. B a x **danadişi**.

2. *məc. dan*. Küt adam, tərs adam, höcət adam. *Danabaşın biridir*.

**DANABAŞLIQ** *is. dan*. Yekəbaşlıq, kütlük, tərslik, höcət. *Danabaşlıq etmək.*

**DANABURNU** *is. bot*. Rütubətli yerlərdə bitən ot bitkisi.

**DANA-BUZOV** *top.* Bütün cavan qaramal. *Otlaqda dana-buzov otlayır.*

**DANAÇA** *is.* Kiçik dana.

**DANADİŞİ** *is. zool*. Rütubətli torpaq altında yaşayan, ağacların və ümumiyyətlə, bitkilərin kökləri ilə qidalanan, başı bədəninə nisbətən böyük olan qurd (böcək). *Danadişi torpağın bir metrə qədər dərinliyində qışlayır.*

**DANA-DOLUQ** *top. dan*. 1. Kiçikyaşlı qaramal. [Heydər bəy:] *Guya ki, bütün Qarabağda dana-doluq oğrusu bir Heydər bəydir*. M.F.Axundzadə.

2. Bəzən istehza və ya etinasızlıqla yetişməmiş, həddi-büluğa çatmamış cavanlar, yaxud qanmaz, mədəniyyətsiz adamlar haqqında.

**DANA-DUNA** *dan*. B a x **dana-doluq** 2-ci mənada. [Hacı Qurban:] *..Dana-dunanı hərə bir yerə dartacaq, Allah xatirinə, mənə rəhm edin, mən yazığam.* N.Vəzirov.

**DANAGAVALI** *is. məh*. İri, yumru, qırmızı gavalı növü.

**DANA-KƏLÇƏ** *is.* Bir yaşa dolmamış camış balası.

**DANAQIRAN** *is. bot*. Yarpaqları zanbaq yarpağına oxşayan bir bitki; novruzçiçəyi.

**DANALOBYA** *is. bot*. İridənəli lobya növü.

**DANDIRMAQ** *icb*. Danmağa məcbur etmək, danmağa səbəb və vasitə olmaq, boynuna almağa qoymamaq.

**DANƏ**[1] [*fars.*] *klas*. b a x **dən** 1-ci mənada. *Əkdikləri danələr gögərdi; Bəh, bəh, necə tamlı meyvə verdi!* M.Ə.Sabir.

**DANƏ**[2] b a x **dənə** 1-ci mənada.

**DANƏNDƏ** *is.* [*fars.*] *klas*. Bilici, bilikli, oxumuş. // Sif. mənasında. *Qəmərin çox oxumuş, danəndə bir dayısı var idi.* (Nağıl). *Bir danəndə adam təyin olunsun Bakıda olan*

*ədliyyə məhkəməsinə .. fəhlələr tərəfindən..* N.Vəzirov.

**DANILMA** "Danılmaq"dan *f.is.*

**DANILMAQ** *məch.* İnkar olunmaq, gizlədilmək.

**DANIŞDIRILMA** "Danışdırılmaq"dan *f.is.*

**DANIŞDIRILMAQ** *məch.* Danışmağa məcbur edilmək. // Dindirilmək, sorğu-sual edilmək. *Müttəhim danışdırıldı.*

**DANIŞDIRMA** "Danışdırmaq"dan *f.is.*

**DANIŞDIRMAQ** *icb.* 1. Danışmağa məcbur etmək. // Soruşmaq, dindirmək, sorğu-sual etmək. *Məhkəmə sədri üçün məsələ aydın idi. Buna baxmayaraq, bir neçə şahidi də danışdırdı.* S.Hüseyn. // Birisi ilə söhbət edib fikrini bilmək. *Bir dəfə yataqxanada tələbələr sözü bir yerə qoydular ki, Qədiri danışdırmamış rəy söyləməsinlər.* Mir Cəlal. [Baxış bəy] *bəlkə də Növrəstəni danışdırmaq, bir ağzını yoxlamaq üçün gözləyirdi.* Ə.Abasov.

2. *məc.* Dilə gətirmək, dilləndirmək, çalmaq, oxutmaq. *Bir ağız da, bir nəfəs də danışdırın sarı simi; Belə bir gün ələ düşməz, dayanmayın qonaq kimi.* S.Vurğun.

3. İnkar şəklində: **danışdırmamaq** – dindirməmək, birindən küsüb əlaqəni kəsmək.

**DANIŞIQ** *is.* 1. Şifahi fikir mübadiləsi; söhbət. *O barədə bu gün danışıq olacaq. Aralarında ciddi danışıq oldu. – Danışıq dananı qurda verər.* (Məsəl). [Güldəstə:] *Ata, mən danışığının hamısını eşitdim.* Ə.Haqverdiyev. // Danışma, söhbət etmə. [Qəhrəman:] *İndi nə danışıq vaxtıdır!.. Aləm dağılır.* H.Nəzərli. *Meşədəki ağaclar küləyin təsirindən uğuldayır, Cavadın danışığına mane olurdu.* Ə.Vəliyev. // Danışma tərzi. *Uzun bir nitq söyləməyə hazırlaşmış kimi görünən katib birdən səsini alçaldıb, danışığının tonunu dəyişdi.* Ə.Sadıq. // Söz-söhbət.

2. Canlı dil, adi danışıq dili. *Bahadır bir neçə həftə danışıqda çox işlənən sözləri* [Sonaya] *öyrətdi və sonra kitabdan az-az dərs verdi.* N.Nərimanov. □ **Danışığa tutmaq** – söhbətlə başını qarışdırmaq, söhbətə tutmaq, söhbətlə yayındırmaq. *Növrəstə daha bir söz deməyib addımlarkən bəy yenə də "qızım" deyə-deyə onu danışığa tutdu.* Ə.Abasov. **Danışıq etmək** – söhbət etmək, danışmaq, məsləhətləşmək, fikir mübadiləsi etmək. [Vəzir:] *Mənə vacib idi ki, siz ilə danışıq edim, qulaq asın!* M.F.Axundzadə.

3. İki tərəf, iki nümayəndə heyəti arasında bir şey haqqında gedən fikir mübadiləsi; müzakirə (çox zaman cəmdə işlədilir). *İki dövlət arasında danışıqlar. Sülh danışıqları. Danışıqlar kəsildi. – Bir çox danışıq və müzakirələrdən sonra razılıq əmələ gəldi.* S.Hüseyn. *Bu danışıqlara nə oğlan və nə qız şəxsən qarışa bilməz.* R.Əfəndiyev. [Mister Tomas və vəzirlərin] *danışıqları bir məzmun ətrafında deyildi.* M.İbrahimov. □ **Danışıq aparmaq** – bir şey haqqında başqası, ya başqaları ilə fikir mübadiləsi etmək, müzakirə etmək. *Mədəni əlaqə haqqında danışıq aparmaq.* – [Qətibə:] *Hüsaməddinə Reydə ordu düzəltməyi tapşırmışam.. Şirvanla, Bağdadla danışıq aparılmaqdadır.* M.S.Ordubadi.

**DANIŞIQSIZ** *zərf* 1. Mübahisəsiz, qeydsiz-şərtsiz, sözsüz, heç bir etiraza yol verməmədən; mütləq. *Danışıqsız tabe olmaq. Əmri danışıqsız yerinə yetirmək. – ..Əvvəllər onun* [Kosaoğlunun] *ağzından nə çıxsa idi, danışıqsız yerinə yetirirdilər.* İ.Şıxlı.

2. Danışdırılmadan, dindirilmədən. *Altı ay həbsxanada danışıqsız yatan Kərimbəy orada eşitdi ki, Yusif "ata!" deyə-deyə can vermişdir.* Mir Cəlal.

**DANIŞILMA** "Danışılmaq"dan *f.is.*

**DANIŞILMAQ** *məch.* Söylənilmək, deyilmək, söhbəti getmək. *Bu barədə heç bir söz danışılmadı. Onun haqqında çox danışılmışdır. – O yerdə ki söz düşəndə, gərək "millət" sözü danışıla, orada "əşxas" ləfzi istemal olunur.* C.Məmmədquluzadə. *Tinlərdə danışılan sözlərə qulaq verməyin.* Qantəmir.

**DANIŞQAN** *sif.* Danışmağı sevən, söhbətcil; dilli, xoşdanışan. *Danışqan adam. Qərənfil Cavadova çox danışqandır.* Ə.Vəliyev.

**DANIŞQANLIQ** *is.* Danışqan adamın xasiyyəti. *Danışqanlığıma görə qınasan da, sənə bir neçə şey də deməyə məcburam.* Ə.Əbülhəsən.

**DANIŞMA** "Danışmaq"dan *f.is.*

**DANIŞMAQ** *f.* 1. Sözlə ifadə etmək, bildirmək, anlatmaq, demək, söyləmək, nəql etmək. *Ağır-ağır danışmaq. Düzünü danışmaq.*

*Həyəcanla danışmaq. Danışa bilməmək. Əhvalatı danışmaq. Məsələni açıq danışmaq.* – [İkram] *Səlimovun yanına gedib, əmisi haqqında bildiklərini ona danışmalı idi.* Ə.Əbülhəsən. *Əbil çalışırdı ki, Dildar arvadın qəlbinə toxunan bir söz belə danışmasın.* Ə.Vəliyev. // Dinmək, söz söyləmək. *Heç kəs danışmırdı. – Bir-birimizin qorxusundan ağzımızı açıb danışa bilmirdik.* M.S.Ordubadi. *Hakim müqəssirin yerindən danışmağına qəzəbləndi*. Mir Cəlal.

2. Bir dildə fikrini yaxşı ifadə etməyi bacarmaq. *Rusca yaxşı danışmaq.*

3. Söhbət etmək. *Yenə o bağ olaydı; Yenə sizə gələydik; Danışaydıq, güləydik*. M.Müşfiq. [Sarıköynək] *xəlvət qalın bir meşə içində bulunduğumuzu qətiyyən nəzərə almayaraq, sərbəstcəsinə danışır, məni məşğul edirdi.* S.Hüseyn.

4. Fikir söyləmək, mühakimə yürütmək, müzakirə etmək. *Bütün şəhər bu barədə danışır. Bu xüsusda hələ danışacağıq. – Hər yerdə müharibə təhlükəsindən böyük bir nifrət və həyəcanla danışırlar.* M.İbrahimov.

5. Çıxış etmək, nitq söyləmək. *Atəşin danışmaq. Hərarətlə danışmaq. – Səlim qızğın danışırdı.* Ə.Vəliyev.

6. Qiymət haqqında bir qərara gəlmək, şərtləşmək; kirə etmək. *Faytonları danışdıq*. M.S.Ordubadi. *Bu qoçular gedib, üç gecə oxumağa xanəndə danışarlar.* R.Əfəndiyev.

7. Bəhs etmək, xəbər vermək, yazmaq. *On altıncı nömrəmizdə molla Tarqulunun siğə barəsində etdiyi vəzindən bir neçə söz danışmışıq.* C.Məmmədquluzadə.

**DANIŞMAMAZLIQ** *is.* Danışmağı sevməmə, danışmaq istəməmə, danışmağı bacarmama. *Danışmamazlıqda Camalı itələyib, onun yerinə oturan Veys dinmədi.* Ə.Əbülhəsən.

**DANİMARKALI** b a x **daniyalı**.

**DANİŞ** *is.* [*fars.*] *klas.* Bilik, elm. *Məcnun dediyin vücudi-kamil; Hər danişə məndən oldu qabil.* Füzuli.

**DANİŞMƏND** *is.* [*fars.*] *klas*. Bilikli, alim.

**DANİYALI** *is.* Daniya əhalisindən olan; danimarkalı.

**DANQ** b a x **daranq**.

**DANQA**[1] *sif.* və *is. dan*. Höcət, söz qəbul etməyən; lovğa, qaba. *Danqa adam. Danqanın biridir.*

**DANQA**[2] *is*. Mal aşığı. *Danqaları çıxmış qoca inəklər.*

**DANQALIQ** b a x **danqazlıq**.

**DANQAZ** *sif. dan.* b a x **danqa**[1]. *Danqaz uşaq*.

**DANQAZLIQ** *is. dan*. Yekəbaşlıq, kobudluq, dikbaşlıq. *Danqazlıq etmək.*

**DANQILDAMA** "Danqıldamaq"dan *f.is.*

**DANQILDAMAQ** *f.* 1. Danqıltı çıxarmaq, danqıltılı səs çıxarmaq. *Qazan düşüb danqıldadı. – ..Elə bil dolu altında dəmir taxtapuş danqıldayır.* Ə.Əbülhəsən.

2. *məc*. Baş-qulaq aparmaq, dəng etmək.

**DANQILDATMA** "Danqıldatmaq"dan *f.is.*

**DANQILDATMAQ** *f.* Metal bir şeyə toxunmaqla, yaxud onu bir şeyə toxundurmaqla danqıltı səsi çıxarmaq. *Vedrəni danqıldatmaq. – Kosa kuryer bayaqdan zəngi dörd dəfə danqıldatmışdı.* S.Rəhimov.

**DANQILTI** *is.* Metal şeyin başqa bir şeyə toxunarkən çıxardığı səs; iri zəngin çıxardığı səs. *Kilsə zənglərinin danqıltısı. – Güclü yağış səsi və navalçanın danqıltısı da* [Tərlanın] *əsəblərinə toxundu.* M.Hüseyn.

**DANQIR** *sif. dan*. Çox çılpaq; daz, keçəl. *Danqır baş*. // Başı bu cür olan. *..Kərbəlayı Tapdıq isə danqır Abbası yazdırdı.* Mir Cəlal.

**DANQIRDAMA** "Danqırdamaq"dan *f.is.*

**DANQIRDAMAQ** b a x **danqıldamaq**.

**DANQIR-DUNQUR** *təql*. Metal şeylərin bir-birinə toxunduqları zaman çıxardıqları səs. *Qazanların danqır-dunquru. Zənglərin danqır-dunquru.*

**DANQIRTI** b a x **danqıltı**.

**DANQIŞ** *is. məh*. Təzəcə çıxmış kiçik buynuz. *Quzunun danqışı.*

**DANQUŞU** *is. zool*. Vağlar dəstəsindən göl quşu.

**DANLAQ** *is.* Töhmət, məzəmmət, tənə. *İşini yaxşı gör, danlaq eşitmə. – Yunis anasının danlağına cavab vermirdi.* Mir Cəlal. *Mədədin danlağını eşidən Xanpəri hirsindən bir yerdə otura bilmirdi.* Ə.Vəliyev.

**DANLAQLI** *sif.* Danlanmış, məzəmmətlənmiş; çox danlanan, həmişə danlanan, danlanc.

**DANLAMA** "Danlamaq"dan *f.is.*

**DANLAMAQ** *f.* Töhmət etmək, məzəmmət etmək. *Zeydi söyür, Kamiləni danlayır; Körpə deyil, hər biri söz anlayır.* M.Ə.Sabir. [Aydın:] *Nə istəyirsən, nə? Bilirəm, yenə deyəcəksən ki, səhv edirsən, yenə məni danlayacaqsan.* C.Cabbarlı.

**DANLANC** *sif.* Çox danlanan, daim danlanan, danlanmağa vərdiş etmiş. *Danlanc uşaq.*

**DANLANMA** "Danlanmaq"dan *f.is.*

**DANLANMAQ** *məch.* Töhmətlənmək, məzəmmətlənmək.

**DANLATMA** "Danlatmaq"dan *f.is.*

**DANLATMAQ** *icb.* Danlanmağa məcbur etmək. *Özünü danlatmaq. Uşağı anasına danlatmaq.*

**DANLAYIB-DANSIMAQ** *f.* Bərk danlamaq, bərk məzəmmət etmək. *Poçt idarəsi rəisinin davası kəsilmək bilmirdi, o, şoferi bərk danlayıb-dansıyırdı.* S.Rəhimov.

**DANMA** "Danmaq"dan *f.is.*

**DANMAQ** *f.* 1. İnkar etmək, boynuna almamaq, boynundan atmaq. *Bildiyini danmaq. Öz sözünü danmaq.* – [Şərəfnisə xanım:] *Yaxşısı budur ki, danaram, deyərəm ki, heç vaxt ağlamırdım.* M.F.Axundzadə. *Zeynal başını aşağı sallamışdı. İlk istintaqda söylədiyi bir sözü dana bilməyəcəkdi.* S.Hüseyn. [Mürşüd:] *Ay İnci, guya mən evli olduğumu danıram?* S.Rəhman. // Bir şeyin mövcud olduğunu qəbul etməmək, rədd etmək, inkar etmək. [Qədir:] *Mən yekəlikdə adamın diriliyini danırlar.* Mir Cəlal.

2. Gizləmək. [Nəbi:] *Həcər, nə olub ki, yeriyə bilmirsən? Həcər yaralandığını ondan danıb cavab verdi..* "Qaçaq Nəbi". *Uzaqlarda, bəlkə dağlar dalında; Nişanlın var, onu məndən danırsan?* Ə.Cəmil. *Sevirəm, nə danım, sevirəm.* O.Sarıvəlli.

**DANSAQ** *dan.* b a x **danlaq**.

**DANSIQ** *is. məh.* Abır, həya. *Abrını itirmək. Məhəbbətini itirmək.*

**DAR**[1] *sif.* 1. Ensiz (*enli* ziddi). *Dar küçə. Dar yol. Dar keçid. Dar dərə.* – *Küçə dar olmağına görə ulaq güc ilə keçirdi.* Çəmənzəminli. *Diyar kişi dar bir cığırla sola tərəf buruldu.* Ə.Məmmədxanlı. ☐ **Dar dəmir yolu** – yaxın məsafələrə çəkilən və yerli əhəmiyyəti olan, relsləri bir-birinə yaxın dəmir yolu. *Bütün mədənlərə tramvay və dar dəmir yolu çəkilmişdir.*

2. Çox sıx, sıxıcı, tarım. *Dar köynək. Dar şalvar. Dar ayaqqabı.*

3. Kiçik, balaca. *Biri deyir: – Azca dardır yerimiz; Nə olsun, genişdir ürəklərimiz.* M.Rahim. *Əslinə baxsan, bu dar həyətdə nə günəşli bir yer, nə də tamaşalı bir şey vardı.* Ə.Əbülhəsən.

4. *məc.* Əhatəsi geniş olmayan; məhdud, birtərəfli. *Dar düşüncə. Dar elmi sahə.*

5. *məc.* Çox az, çox məhdud, qeyri-kafi, yaxud namünasib. *Vaxt çox dar idi.* // Eyni mənada bəzən "bu dar vaxtı, bu dar vaxtda" tərkib şəklində işlənir. *Birdən qapı döyülür, molla öz-özünə hirslənir ki, yenə görəsən kimdi bu dar vaxtı gəlib çıxdı.* "M.N.lətif." [Xanımnaz:] *Bu dar vaxtı sən getmə. Qaranlıqdır, sən dayan, mən gedim.* C.Cabbarlı. *Ancaq indi, bu dar vaxtda söhbət açmağı lazım bilmədi.* Mir Cəlal.

◊ **Dar ayaqda** – çətin zamanda, çətin vəziyyətə düşəndə. *Dar ayaqda kömək etmək. Dar ayaqda imdada çatmaq.* **Dar etmək** (bəzən "başına" sözü ilə) – dözülməz etmək, məşəqqətli etmək. *Evi başına dar etmək. Dünyanı başına dar etmək.* **Dar gün** – həyatın çox çətin, çox ağır, böhranlı, məhrumiyyətlərlə dolu vaxtı. *Yarı görmək istəyir; Ürəyim bu dar gündə.* (Bayatı). *Aygün alıb çağasını bağrına basır; Analara təsəllidir dar gündə övlad.* S.Vurğun. *Vətənin dar günündə atıldın ön səngərə; On yara aldınsa da, uf demədin bir kərə.* S.Rüstəm. **Dar kəsilmək** – b a x **dar olmaq**. *Bir qıy vursam, bu gün dünya düşmənlərə dar kəsilər.* S.Vurğun. **Dar olmaq** – dözülməz olmaq. **Dara düşmək** – 1) maddi cəhətdən ağır vəziyyətə düşmək, sıxıntı çəkmək, yoxsul hala düşmək; 2) çətin vəziyyətə düşmək, işi çətinə düşmək. *Tanrı, yaman gündə düşmüşük dara; Bizə özün kömək ol, aman, aman!* "Koroğlu". *Oğul, harda dara düşsən, arxalan hünərinə; Sən ölümü bir an belə gətirmə gözlərinə.* S.Vurğun. **Dara qısnamaq** – bərkə çəkmək, sıxışdırmaq, çətin və çıxılmaz vəziyyətə salmaq. *Bəy Nabatoğlunu bərk dara qısnamış, onun gözünün*

*ağı-qarası bircə qızını evinə qulluqçu istəyirdi.* S.Rəhimov. **Dara salmaq** – b a x **dara qısnamaq**. **Darda qalmaq (olmaq)** – çətin vəziyyətə düşmək, çətinlik çəkmək, ehtiyac içində olmaq. *Qalsan da zillətdə, qalsan da darda; Bağlan azadlığa, azad zəhmətə.* M.Rahim. *O heç vaxt sənin darda qalmağına razı olmaz.* M.Hüseyn. **Dardan çıxmaq** – ağır və çətin vəziyyətdən, məhrumiyyətdən qurtarmaq.

**DAR²** *is.* [*fars.*] Edama məhkum olunanları asmaq üçün dikəldilən dirək; dar ağacı. *Dar ağacını da təpənin üstündə qurublar.* "Koroğlu". [Konsul:] *Bu dar ağacları şahənşah hökumətinin əmri ilə qurulmuşdur.* M.S.Ordubadi. ☐ **Dar ağacından asmaq dara çəkmək** – dar ağacından asmaq yolu ilə edam etmək. *Belə zaman hara, qoç iyid hara? Mərdləri çəkirlər namərdlər dara.* "Koroğlu". *Xan .. deyirdi: – Üç gün qızıl quşlarıma ət verməyin; Zamanı da dara çəkin.* Çəmənzəminli.

**DAR³** *is.* [*ər.*] *klas.* Əsil mənası "ev", "məskən", "məhəl", "məkan" olub, klassik ədəbiyyatda bir sıra tərkiblərdə işlənir. **Dari-bəqa** *din.* – o dünya, axirət. **Dari-bəqayə rehlət etmək (buyurmaq)** *tənt. köhn.* – ölmək, vəfat etmək. *Bu iki yüz müəllimlərdən bu anəcən bir neçəsi dari-bəqayə rehlət edib.* F.Köçərli. *Qəhvəni içən tək ağa dari-bəqayə rehlət buyurdu.* Ə.Haqverdiyev. **Dari-fəna** *din.* – yaşadığımız dünya. **Dari-şəfa** – müalicə evi, şəfa verən yer.

**...dar** [*fars.*] Bəzi isimlərin axırına gətirilərək onlara müxtəlif məna verən şəkilçi; məs.: evdar, əməkdar, mülkədar, binəkdar, məhsuldar və s.

**DARABA** *is. məh.* 1. Taxtadan və s.-dən hasar; arakəsmə. *Otağı daraba ilə iki hissəyə ayırmaq.*

2. Evin yanında taxtadan və s.-dən düzəldilmiş tikili. *Bu dünyada əlindən min bir peşə gəlirdi: qaşıq qayırmaq, anbar qurmaq, daraba salmaq, .. hər şey.* S.Rəhimov.

3. Taxıl saxlamaq üçün böyük taxta yeşik. *Darabadan bir ovuc düyü götür.*

**DARA-BARA** *is.* Mübahisə, dalaşma, dava, küsüşmə, söyüşmə.

**DARAĞAOXŞAR** b a x **daraqvari**.

**DARAQ** *is.* 1. Saçı darayıb düzəltmək üçün dişli alət. *Narındişli daraq. Başını daraqla daramaq. – Siyah zülfü daraq ilə dara, gör.* Qurbani. ☐ **Daraq çəkmək** – daramaq. *Müşkünazın qoyun-qoltuğuna sərinlik dolduqca, külək saçlarına daraq çəkdikcə ürəyi dincəlir, istisi azalırdı.* Ə.Vəliyev. **Daraq görməmək** – heç daranmamaq. *Qıvrım saçlarının bir-birinə qarışması saçlarının daraq görmədiyini bildirirdi.* M.S.Ordubadi. // Qadınların saçlarını bir yerdə saxlamaq və bəzək üçün saçlarına taxdıqları zinət şey.

2. Yun və s. lifli şeyləri daramaq üçün alət. *Yun darağı. Kətan darağı.*

3. Müxtəlif məqsədlər üçün işlədilən darağaoxşar alətlərin, yaxud onların bu şəkildə olan hissələrinin adı. *İpləri darağa düzmək. Toxuma dəzgahının darağı. Kombaynın darağı.*

4. Araba oxunun söykəndiyi oyuq. *Pəri arabanın darağını buraxmırdı.* Ə.Əbülhəsən.

5. Silahın (tüfəngin və s.-nin) sandığına keçirilən patronları yan-yana qoymaq üçün qab, qutu. *Üçüncü gün onların patronları qurtardı, hərəsində ancaq bir daraq patron qalmışdı.* "Qaçaq Nəbi". *Tüfəngin üstündəki dolu patrondaşın daraqları parıldayırdı.* M.Hüseyn. *Daraqlar boşalıb, indi neyləmək?* M.Rahim.

6. Ot dırmığı. *Biçilən otu daraqla tağlamaq.*

7. *zool.* Balıqların hava yerinə su alıb verdikləri dəlikləri qapayan qulağaoxşar qanadcıqlar.

8. Bəzi quşların başında yelpiyəoxşar kəkil; pipik. *Şanapipiyin darağı.*

9. Bal şanı. *Bir daraq bal. Qış üçün hazırlanmış daraq balı.*

10. Pambıq gülü. *Quraqlıq olanda pambıq darağını tökər.*

**DARAQAĞZI** *is.* Darağın dişlərindən tökülən yun və s. qırıntıları.

**DARAQBATMAZ** *f.sif.* Qalın, gur, sıx, yaxud dolaşıq, pırtlaşıq, dolaşıb bir-birinə sarılmış. [Sevil] *..əlini sıx və daraqbatmaz qara saçlarına aparıb gəzdirdi.* S.Rəhimov.

**DARAQCIQ** *is.* Kiçik daraq.

**DARAQÇI** *is.* 1. Daraq qayıran usta.

2. Muzdla yun darayan (adam). *Daraqçıya daramaq üçün yun aparmaq.*

**DARAQÇILIQ** *is*. 1. Daraq qayırma sənəti.

2. Yun darama sənəti. *Daraqçılıqla məşğul olmaq*.

**DARAQ-DARAQ** *zərf* Daraqlar şəklində, yan-yana düzülmüş halda.

**DARAQDİŞİ** *zərf* Daraq dişləri kimi bir boyda, yan-yana və sıx. *Sərvinazla Muradın briqadalarının əkdiyi pambıq daraqdişi bitmiş*(*di*). Ə.Vəliyev.

**DARAQLAMA** "Daraqlamaq"dan *f.is*.

**DARAQLAMAQ** *f*. 1. Daraqdan keçirmək, daraqla daramaq, daraqla təmizləmək. *Yunu daraqlamaq*. // Daraqla düzəltmək. *Saçlarını daraqlamaq. Başını daraqlamaq*. ☐ **Əllərini daraqlamaq** – b a x **əl**.

2. Silaha patronlu daraq keçirmək. *Tüfəngi daraqlamaq. – Azərbaycan torpağına yad basmasın ayağını; Söyləyərək daraqladı öz mehriban yarağını*. M.Rahim.

3. Əllərini yanlarına açaraq yolu, ya qapını tutmaq, keçməyə mane olmaq. *Bu hində qapı açıldı, bir cavan oğlan qapını daraqlayıb təəccüblə gözlərini dirədi Xudayar bəyin gözünə*. C.Məmmədquluzadə.

4. Gül açmaq. *Pambıqlar daraqlamışdır*.

5. Sığallamaq, tumarlamaq. *Quzunu da raqlamaq*.

**DARAQLANMA** *is*. 1. "Daraqlanmaq"-dan *f.is*.

2. Pambığın gülaçma dövrü.

**DARAQLANMAQ** 1. *məch*. Daraqla daranmaq, daraqla təmizlənmək, daraqdan keçirilmək. *Yun daraqlanmışdır*.

2. *f*. Gül açmaq. *Pambıq kolları yaxşı inkişaf etmiş, daraqlanmışdır*. "Az. qad.".

**DARAQLATMA** "Daraqlatmaq"dan *f.is*.

**DARAQLATMAQ** *icb*. Daraqlama işi gördürmək.

**DARAQLI** *sif*. Darağı olan, başında, ya bədənində darağa bənzər nişanı olan. *Daraqlı balıq. Başı daraqlı quş*.

**DARAQLIQ** *sif*. 1. Daraq qayrılmağa yarayan. *Daraqlıq buynuz*.

2, Daranmaq üçün ayrılan. *Daraqlıq yun*.

3. Bir dəfə daraqdan keçirməyə kifayət edən. *Bir neçə daraqlıq yun*.

**DARAQOTU** *is. bot*. Quru və daşlı yamaclarda bitən dənli ot bitkisi.

**DARAQVARİ** *sif*. Darağaoxşar, daraq kimi diş-diş.

**DARALDICI** *sif*. Daraldan, darlaşdıran, dar hala salan, genəlməyə qoymayan. *Damarları daraldıcı dərman*.

**DARALDILMA** "Daraldılmaq"dan *f.is*.

**DARALDILMAQ** *məch*. Dar edilmək, dar hala salınmaq. *Şalvarın balağı daraldılmışdır*.

**DARALMA** "Daralmaq"dan *f.is*.

**DARALMAQ** *f*. 1. Dar hala düşmək, darlaşmaq, dar olmaq, enliliyi azalmaq. *Uzağa getdikcə yol daralır*. // Sıxılmaq, sıxlaşmaq, yığılmaq, kiçilmək. *Ayaqqabılar daralmışdır. Köynək yığılıb daraldı*.

2. Tükənmək. [Sona xanım:] *Hövsələm daralıb, ağzıma gələni söyləyirəm*.. M.F.Axundzadə.

3. Təngişmək, sıxılmaq, təng olmaq. *Acığından Qulunun bütün vücudu titrəyir, daralmış köksünə sığmayan qəlbi az qala partlayırdı*. A.Şaiq.

4. *məc*. Qurtarmaq üzrə olmaq; məhdudlaşmaq, qısalmaq. *Sağ olun! Çən gəlir, hava qaralır; Sonra gecikərik, gün də daralır*. S.Vurğun.

5. B a x **darılmaq**. *Nə əmrə daralmış, nə küskünəm mən; Həyatın həvəsi qalxır sinəmdən*. R.Rza.

**DARALTMA** "Daraltmaq"dan *f.is*.

**DARALTMAQ** *f*. 1. Dar etmək, dar hala salmaq, genliyini azaltmaq; darlaşdırmaq. *Dairəni daraltmaq. Paltarın qolunu daraltmaq. – Kərəmov şalvarının balağını da bir-iki santimetr daraltmışdır*. İ.Əfəndiyev.

2. *məc*. Azaltmaq, kiçiltmək, məhdudlaşdırmaq. *Məsələnin mənasını daraltmaq. Məsələnin mənasını* (*əhəmiyyətini*) *daraltmaq*.

**DARAM** *sif*. Tarım; çox dar. *Dağbaşev danışa-danışa daram şinelinin dəmir düymələri ilə əlləşməkdə davam edirdi*. S.Rəhimov.

**DARAMA** "Daramaq"dan *f.is*.

**DARAMAQ** *f*. 1. Daraqla tükləri bir-birindən ayırıb nizama salmaq. *Başını daramaq*. – [Qərənfil] *ikinci mərtəbədə bədənnüma güzgünün qabağında durub .. saçlarını darayırdı*. M.Hüseyn. *Bahardır, gəl çıxaq düzə, sevgilim! Dara saçlarını, bəzə, sevgilim!* M.Rahim.

2. Daraqdan keçirmək, daraqlayıb təmizləmək. [Dilbərin] *yaşı yüzü çoxdan ötmüş qoca nənəsi Həcər isə döşək üstündə oturaraq yun darayırdı.* Ə.Sadıq.

3. Ot, saman və s.-ni şana və ya dırmıqla yığmaq, toplamaq; dırmıqlamaq. *Əldə biçinçi darağı sərbəsər; Ot darayırlar qarılar hər tərəf.* A.Səhhət.

4. Ağacın, kolun və s.-nin lazımsız budaqlarını kəsmək. *Darayıb, su verib calaqlamısan; Şaxtadan qışda yaxşı saxlamısan.* A.Səhhət.

**DARAMLIQ** bax **tarımlıq**.

**DARANIQ** *sif.* Daranılmış. *Taya dibində də incəbelli bir qız daranıq saçlı bir oğlanla öpüşür*. C.Cabbarlı.

**DARANQ** *təql*. Metal şeyin başqa bir şeyə toxunarkən çıxardığı səs.

**DARANQI** *is.* 1. *bot*. Qovaq cinsindən ağac; piramidal qovaq.

2. *məh*. Ağaclardan kəsilib tökülmüş quru budaqlar; çır-çırpı. *Daranqı yığmaq*.

**DARANQILTI** bax **danqıltı**. *Damlardan daranqıltı ilə tənəkə parçaları düşür, qum tökülür*. Mir Cəlal. – *..Dəmirçilər cərgəsindəki bütün bu qulaq batıran daranqıltı, gumbultu içərisindən usta bu oğlanın ağır sükutunu eşidirdi..* Ə.Məmmədxanlı.

**DARANMA** "Daranmaq"dan *f.is*.

**DARANMAQ** 1. *məch*. Daraqla bir-birindən ayrılıb nizama salınmaq, düzəldilmək. [Qərib:] *Siyah saçları darandı; Canım həsrətində yandı.* "Aşıq Qərib". [Hindli qız:] *Darandıqca qıvrılar tel; Üz üstündə yana düşər*. A.Şaiq.

2. *məch*. Daraqdan keçirilmək, daraqlanıb təmizlənmək. *Yun daranmışdır.*

3. *qayıd.* Öz başını daramaq. *Yuyundun, darandın, qarlar kimi saf; Tellərin sığallı, gözlərin şəffaf.* Ə.Cavad. *Kamal durub geyindi, darandı, yuyundu.* S.Rəhimov.

4. Bax **daraşmaq**. *..Təbii sərvətini əldə etmək üçün* [imperialistlər] *cənubdan və şimaldan İranın cəmdəyinə daranmışdılar*. M.S.Ordubadi.

5. Bax **dırmaşmaq**. [Qız-gəlinlər] *səhəngi atırlar çiyinlərinə, kəklik kimi daranırlar dağ yuxarı*. N.Vəzirov.

**DARANMIŞ** *f. sif.* 1. Daraqla bir-birindən ayrılıb nizama salınmış, düzəldilmiş. *Daranmış saç.* – [Səfainin] *..Orta boyu, səliqə ilə yuxarı daranmış və yağlanmış qara saçları, mülayim siması və yumşaq səsi onu xəfiyyə rəisindən artıq şah təlxəyinə oxşadırdı.* M.İbrahimov.

2. Daraqla təmizlənmiş, daraqdan keçirilmiş. *Daranmış yun*.

**DARAŞDIRMA** "Daraşdırmaq"dan *f.is*.

**DARAŞDIRMAQ** *f.* Daraşmasına səbəb və vasitə olmaq. *Qarışqaları daraşdırmaq*.

**DARAŞMA** "Daraşmaq"dan *f.is*.

**DARAŞMAQ** *f.* Bir şeyin üzərinə doluşmaq, toplaşmaq, yığışmaq; qonmaq. *Qarışqalar mürəbbəyə daraşır. – Sürüyə qurd daraşınca, Qızıl onlarla boğuşa-boğuşa sürünü bu iki təpənin arasına qədər gətirib soxmuşdu*. A.Şaiq. *..Sanki bunlar – bal arısı kimi tarlaya, kotana, suya, traktora daraşanlar keçən il işə çıxan adamlar deyil.* Mir Cəlal. // Məc. mənada (bəzən "vücuduna", "canına" sözləri ilə). *Qərinələrlə millətimizin şirin canına milyonlarca ac mikroblar daraşıb qanını sormuşdur.* C.Məmmədquluzadə. *Hər yandan gələn əhali qarışqa kimi konkaların vücuduna daraşmışdı*. M.S.Ordubadi. □ **Bir-birinə daraşmaq** *məc*. – bir-biri ilə dalaşmaq, mübarizə etmək, boğuşmaq, çəkişmək, bir-birini məhv etməyə çalışmaq. *Kənddə iki nəsil, canavar kimi bir-birinə daraşdı.* Mir Cəlal.

**DARATDIRMA** "Daratdırmaq"dan *f.is*.

**DARATDIRMAQ** *icb*. Üçüncü şəxs vasitəsilə daratmaq. *Saçlarını daratdırmaq*.

**DARATMA** "Daratmaq"dan *f.is.*

**DARATMAQ** *icb*. Darama işi gördürmək.

**DARAYI** *is. köhn.* Qırmızı-bənövşəyi rəngli nazik, zərif ipək parça. *Darayı yorğanüzü. – Ayı handa, darayı handa.* (Ata. sözü). *Gözəllər geyinib darayıdan xası; Silinsin, könlümün qalmasın pası.* (Qoşma). // *sif.* Bu parçadan tikilmiş. *..Allahqulu qurcuxub darayı kisəsini çıxartdı.* Çəmənzəminli.

**DARBADAĞIN** bax **darmadağın**. [Həsən:] *Mən də sənə zad deyiləm, vurram, başın; Darbadağın lap dağılar, rədd ol burdan!* Ü.Hacıbəyov. [Uşaq] *bir kərə qılıncını*

*çəkərək .. oyuncaqları darbadağın etdi.* M.S.Ordubadi.

**DARBALAQ** *is.* Gödək kişi şalvarına oxşar qadın dizliyi. *Biz* [alman soldatının] *üstünü axtardıq. Bir darbalaq, iki cüt arvad corabı çıxdı.* Mir Cəlal.

**DARCA** *sif.* Çox dar, çox məhdud. *Bu süstlüyə .. səbəb camaatımızı təşkil edən hər bir sinfin öz darca və qaranlıq dairəsində güzəran etməyi olubdur.* F.Köçərli. // Bir qədər dar.

**DARÇI** *is. köhn.* Dar ağacı quran, ya məhkumu dar ağacından asan adam. *Darçı dəmbədəm idi ki, həmin adamları tutub çəkə dara. Siman tez özünü yetirib gördü ki, dar ağacı qurulub.* (Nağıl).

**DARÇIN** *is.* [*fars.*] Darçın ağacının qabığından hazırlanan gözəl iyi və tünd dadı olan quru toz şəklində ədviyyə. *Xörəyə darçın səpmək. Darçın çayı.* – [İbrahim:] *Bala, yoxsa sənə soyuq dəyib? Sənin üçün bu saat darçın çayı bişirərəm. İçib tərlərsən, durarsan ayağa.* Ə.Haqverdiyev.

**DARÇINI** *sif.* Darçın rəngli, darçın rəngində olan; qəhvəyi. *Darçını parça. – "İsti" rənglər dedikdə isə, od rənginə çəkən rənglər – qırmızı, sarı, .. darçını və bunlara oxşar rənglər nəzərdə tutulur.* Ə.Salamzadə.

**DARÇINLI** *sif.* Tərkibində darçın olan, yaxud darçından hazırlanmış, darçın qatılmış, darçın tökülmüş. *Darçınlı firni.*

**DAR-DAR** *zərf* Balaca uşağın ilk yerimə tərzi. *O, dar-dar yeriyəndə, ayağa duranda* [əvvəlcə] *bu cəhrədən tutub qalxırdı.* Ə.Əbülhəsən.

**DAR-DÜDÜK** *sif.* Çox dar, bədənin ölçüsündən çox-çox dar. *Dar-düdük şalvar.*

**DARDÜŞÜNCƏLİ** *sif.* Həyati məsələləri dərindən dərk edə bilməyən, düşüncəsi məhdud olan. *Dardüşüncəli adam.*

**DARDÜŞÜNCƏLİLİK** *is.* Düşüncə cəhətdən məhdudluq, şüur məhdudluğu.

**DARFİKİRLİ** b a x **dardüşüncəli**.

**DARFİKİRLİLİK** b a x **dardüşüncəlilik**.

**DARGÖZ(LÜ)** *sif.* Paxıl, gözü götürməyən. *O göstərir ki, həyatda yaxşı adamlar olduğu kimi, dargöz adamlar da çoxdur.* S.S.Axundov. *Hacı Sultanın dükan qonşuları bir taqım paxıl, dargöz adamlardı.* S.Hüseyn. *Fərəc bəy də atası kimi forslu, təşəxxüslü, paxıl, dargöz bir adam imiş.* Ə.Vəliyev. // Xəsis.

**DARGÖZLÜ(LÜ)K** *is.* Paxıllıq, gözügötürməzlik; xəsislik. [Bülənd:] *...Məni tərif etməkləri onların dargözlülüyündən və uzağı görmədiklərindəndir.* Ə.Əbülhəsən.

**DARĞA** *is.* [*monq.*] 1. *tar.* Şəhər, qəza, mahal, ya vilayət hakimi. *Padşahın şəhər darğası yolnan gedirdi, güzarı düşdü bu bağa.* (Nağıl). *Sən demə, bu bina şəhərin darğasının eviymiş.* "M.N.lətif." // Keçmiş zamanda vergi yığmaq üçün hakim, hökmdar, xan və b. tərəfindən kəndə göndərilən məmur. [Nəcəf bəy:] *Buyur, mirzə, aparıb kənddə verərsən darğaya. Necə ki lazımdır əməl eylər.* Ə.Haqverdiyev. *Darğa lələş məhsul vaxtı bir dərzi gözündən qaçırmaz*(*dı*). S.Rəhimov.

2. *tar.* Bazar keşikçilərinin başçısı. *Sübh olunca gecələr darğa kimi; Yatmayır, qırqır edir qarğa kimi.* M.Ə.Sabir.

3. *məc.* Özünü böyük sayan, heç kəs tərəfindən vəkil edilmədiyi halda özünü vəkil kimi aparan adam haqqında. ☐ **Darğa tikmək** – hakim qoymaq, hakim təyin etmək, vəkil etmək. [Xan:] *Səni bu evdə kim darğa tikib, kim?* N.Vəzirov.

**DARĞABAŞI** *is. tar.* Bir neçə darğanın böyüyü. *Al, – dedim, – get, bunu darğabaşıya ver, Hacı Səməd xanın fərmanıdır.* M.S.Ordubadi.

**DARĞALIQ** *is.* 1. *tar.* Darğanın işi, vəzifəsi. [Həsən Namaza:] *Mən istəmərəm ki, sənin əlindən darğalığı alıb mənə versinlər.* Ə.Haqverdiyev. [Paşa bəy:] *Yaxşı deyiblər ki, evində yoxdur urvalıq, könlündən keçir darğalıq.* Ə.Vəliyev.

2. *məc.* Böyüklük, ağalıq. *Darğalıq etmək. – Bu fəna iş nə idi tulladınız ortalığa; Sizi kim qoydu bizim üstümüzə darğalığa.* Ə.Nəzmi.

**DARĞAN** *is.* Qışın son on günü. *Darğanda yağmasa, xırmanda yağar.* (Ata. sözü).

**DARĞIN** *sif.* 1. İncik, dərdli, küskün, pərişan, pərt. *İyirmi beş bahar görmüş olan bu adam altmış xəzan keçirmiş qocalar qədər yorğun, darğın, ölgün görünürdü.* A.Şaiq. *Böyük bir şairin darğın xəyalı; Vətən çöllərini pərişan gəzir...* S.Vurğun. *Düşün-*

*dürür onu insanın halı; Darğındır nə qədər fikri, xəyalı!..* M.Rahim.

2. Hiddətli, qəzəbli. *Darğın sular kimi coşub çağladım; Gözümdən od çıxdı, başımdan duman.* M.Müşfiq.

**DARĞINLIQ** *is.* 1. Küskünlük, inciklik, ürəyisınıqlıq, pərişanlıq, pərtlik. [Şərifzadə:] *Aranızdakı darğınlıq və küdurətin tamamilə bərtərəf olması üçün bir-biriniz ilə ətraflı danışmaq və razılaşmaq lazımdır.* S.Hüseyn. *Süsən Bünyadın darğınlığını, onunla danışmaq həvəsində olmadığını görürdü.* Ə.Əbülhəsən.

2. Hiddət, qəzəb.

**DARXƏTLİ** *sif.* Relslərinin arası dar olan. *Darxətli dəmir yolu.*

**DARI** *is.* Yumru toxumları olan birillik taxıl bitkisi və bu bitkinin dəni. *Darı əkini. – Ac toyuq yuxusunda darı görər.* (Ata. sözü). // Darıdan bişirilmiş (hazırlanmış). *Darı çörəyi. Darı yarması.* – [Tubu:] *De görüm, sən darı cadını ayrana doğrayıb yeyəndə ağa da bir qaşıq götürüb səninlə o doğramadan yeyəcəkdirmi?* Ə.Haqverdiyev.

**DARIXDIRICI** *sif.* Cansıxıcı, ürəksıxan, çox maraqsız; yekrəng, yeknəsəq. *Darıxdırıcı iş. Darıxdırıcı söz. Darıxdırıcı həyat.*

**DARIXDIRICILIQ** *is.* Darıxdırıcı şeyin hal və keyfiyyəti; cansıxıcılıq, ürəksıxıcılıq, çox maraqsızlıq, yeknəsəqlik. *Söhbətin darıxdırıcılığı. İşin darıxdırıcılığı. – Evlərin təhər-töhüründə bir darıxdırıcılıq vardı.* Ə.Əbülhəsən.

**DARIXDIRMA** "Darıxdırmaq"dan *f.is.*

**DARIXDIRMAQ** *f.* Ürəyini sıxmaq, təngə gətirmək, bezikdirmək. // Əsəbiləşdirmək, acıqlandırmaq. *Kişi məni elə darıxdırıb ki, vallah, istəyirəm elə özümü boğam, öldürəm..* N.Vəzirov. *Qış səfəri, tək yol könlü darıxdırır, can sıxır.* A.Səhhət. [Körpənin] *ağlaması da Gülaranı darıxdırır, incidirdi.* Ə.Vəliyev.

**DARIXMA** "Darıxmaq"dan *f.is.*

**DARIXMAQ** *f.* 1. Sıxılmaq, canı sıxılmaq, bıqmaq, bezmək, təngə gəlmək, narahat olmaq, əsəbiləşmək. *Hər şey üçün adam darıxmaz. Darıxıram, vaxt az qalıb.* // Ürəyi sıxılmaq, hövsələsizlik göstərmək. *Qulu, sən heç darıxma, ancaq bir az döz.* N.Nərimanov. *Mirzağa indi öz evlərində darıxır, könlü heç açılmayırdı.* S.Hüseyn. // Sıxılmaq, özünü çox pis hiss etmək. *Qədir kişi bu hörmətlərdən darıxmır, bunu özünün yaxşı işləməsi ilə əlaqədar bilirdi.* Ə.Sadıq.

2. Təngnəfəs olmaq, nəfəsi kəsilmək, boğulan kimi olmaq, hava çatmamaq. *İstidən adamın ürəyi darıxır.*

3. Bir şəxsin, ya şeyin olmadığını iztirab və ürək acısı ilə hiss etmək, bir şəxsi, ya şeyi görməyi, yaxud onunla bir yerdə olmağı həsrətlə arzu etmək. *Vətən üçün darıxmaq. İş üçün darıxmaq.*

**DARIXSINMA** "Darıxsınmaq"dan *f.is.*

**DARIXSINMAQ** *f.* Özünü darıxmış kimi göstərmək; bir qədər darıxmaq, darıxan kimi olmaq. *Kəlbalı darıxsınaraq böyük işlərin içərisində çaşıb qalan adamlar kimi: – Qulluq əmridir, bilirsən, molla! – dedi.* S.Rəhimov.

**DARILMA** "Darılmaq"dan *f.is.*

**DARILMAQ** *f.* Acığı tutmaq, hirslənmək, hiddətlənmək, hövsələdən çıxmaq. [Şərifzadə] *Mehribanı boşadığı üçün olduqca darılmış, Zeynalın belə yersiz hərəkətindən dolayı acıqlanmışdı.* S.Hüseyn. [Veys:] *Paxıl oğlu, paxıl, – deyə Dövlətə darıldı.* Ə.Əbülhəsən. *Sənsiz gördüm, mələklərə darıldım; Endim yerə, qədəminə sarıldım.* Ə.Cavad. // Ürəyi sıxılmaq, kədərlənmək, məyus olmaq, incimək. [Heydər bəy:] *Hacı, səfərdə adamın başına çox iş gələr, gərək darılmamaq, söyləmək vaxtı deyil, indi üstümüzə tökülərlər.* M.F.Axundzadə. *Özünü toxtaq tut bir az; Düşəndə dar günə insan darılmaz.* S.Vurğun. *Qaraş sıxılıb darılaraq divana oturub əvvəlcə heç kəslə danışmırdı.* M.İbrahimov.

**DARIMAQ**[1] *f. məh.* 1. Yırtmaq, dağıtmaq, cırmaqlamaq. *Oğlunun quldurlar tərəfindən öldürüldüyünü güman edən arvad üz-gözünü darıdı.* Ə.Vəliyev.

2. Bax **darışmaq**. *Qələnin adamı yetdi yarıya; Necə ki qoyuna ac qurd darıya.* Q.Zakir.

**DARIMAQ**[2] *f. məh.* Arxasınca danışmaq, paxıllıq etmək. *Yazığı darıyıb heç ediblər. Darımaqdan yorulmurlar.*

**DARIMAQ**[3] *f. məh.* Yayılmaq, düşmək. *Mala yaman xəstəlik darıyıb.*

**DARIOTU** *is. bot.* Daşlı yamaclarda bitən birillik xırda ot bitkisi.

**DARISQAL** *sif.* 1. Çox dar, ensiz. *Darısqal yol. – Dərin, darısqal dibində dərənin; Rəd kimi guruldayır baltalar.* A.Səhhət. *Əjdər bu təpəciklərdən enib kəndin darısqal küçələrinə girdi.* S.Rəhman.

2. Sahəsi çox kiçik olan. *Darısqal otaq. Darısqal yer. – Fəhlə kazarmaları çox çirklidir, darısqaldır.* M.S.Ordubadi. *Bura darısqal, alçaq, yarıqaranlıq bir otaq idi.* Mir Cəlal. *Darısqal bir daxma var, qabağı ağaclıqdır.* M.Seyidzadə.

3. *məc.* B a x **dar**[1] 4-cü mənada. *Saqqalı uzun, kəlləsi küt, fikri darısqal.* M.Möcüz.

**DARISQALLAŞDIRILMA** "Darısqallaşdırılmaq"dan *f.is.*

**DARISQALLAŞDIRILMAQ** *məch.* Darısqal edilmək, darısqal hala salınmaq.

**DARISQALLAŞDIRMA** "Darısqallaşdırmaq"dan *f.is.*

**DARISQALLAŞDIRMAQ** *f.* Darısqal etmək, darısqal hala salmaq. *Mənzillərin avadanlığı və mebeli çox sadə olmalı, otağı darısqallaşdırmamalıdır.* "Az. qad."

**DARISQALLAŞMA** "Darısqallaşmaq"-dan *f.is.*

**DARISQALLAŞMAQ** *f.* Daha darısqal olmaq, darısqal hala gəlmək.

**DARISQALLIQ** *is.* Darısqal şeyin halı, bir yerin darısqal olması. *Darısqallıqdan darıxmaq. Darısqallıqdan şikayətlənmək.– Qəfil ölüm olmasın .. Qara zülüm olmasın; Darısqallığa düşən fikir, könül olmasın.* R.Rza. ◻ **Darısqallıq etmək (eləmək)** – kifayət etməmək, çatışmamaq, yetməmək.

**DARIŞDIRMAQ** b a x **daraşdırmaq**.

**DARIŞLIQ** b a x **darısqallıq**. *Tiflisdə camaat o qədər çox idi ki, gəzməyə yekə bağ darışlıq edirdi..* "Mol. Nəsr."

**DARIŞMA** "Darışmaq"dan *f.is.*

**DARIŞMAQ** b a x **daraşmaq**. *Ona bir çox milçək darışmış idi; Yazığın haləti qarışmış idi.* M.Ə.Sabir.

**DARKEŞLİK** *is. məh.* Darısqallıq.

**DARQURSAQ(LI)** *sif. dan.* Səbirsiz, hövsələsiz, kəmfürsət, dözümsüz, tez özündən çıxan. *Darqursaq adam.*

**DARQURSAQLIQ** *is. dan.* Səbirsizlik, hövsələsizlik, kəmfürsətlik; darqursaq adamın xasiyyəti. *Darqursaqlıq etmək.*

**DARLAŞDIRILMA** "Darlaşdırılmaq"dan *f.is.*

**DARLAŞDIRILMAQ** *məch.* Daha dar edilmək; genişliyi, eni azaldılmaq.

**DARLAŞDIRMA** "Darlaşdırmaq"dan *f.is.*

**DARLAŞDIRMAQ** *f.* Daha dar etmək, dar hala salmaq; genişliyini, enini azaltmaq.

**DARLAŞMA** "Darlaşmaq"dan *f.is.*

**DARLAŞMAQ** *f.* Daha dar olmaq, dar hala düşmək, eni azalmaq.

**DARLIQ** *is.* 1. Dar şeyin halı; ensizlik. *Yolun darlığı. Keçidin darlığı.* // Yer (sahə) azlığı; darısqallıq. *Mənzilin darlığı.* // Sıxlıq, tarımlıq. *Şalvarın darlığı. Paltarın darlığı.*

2. Sıxıntı, tənglik. *Nəfəs darlığı.*

3. *məc.* Maddi sıxıntı, çətinlik, ehtiyac, yoxsulluq; məhrumiyyət. *Varlığa nə darlıq?!* (Ata. sözü). ◻ **Darlığa düşmək** – 1) maddi cəhətdən çətin vəziyyətə düşmək, ehtiyacı olmaq; 2) ağır, çətin vəziyyətə düşmək. *Simurq dedi: – Siman, al bu tükü, darlığa düşsən, bu tükləri bir-birinə çəkərsən, mən harada olsam, gəlib harayına çataram.* (Nağıl). **Darlıq çəkmək** – maddi sıxıntı çəkmək, ehtiyac içində olmaq. *Onun köməksiz, əlacsız və möhtac baxışları özünün maddi tərəfdən darlıq çəkdiyini də göstərirdi.* M.S.Ordubadi.

4. Azlıq, məhdudluq, çatışmazlıq. *Vaxtın darlığı.*

**DARMACAL** *zərf dan.* İşin çox qızğın, macal olmadığı bir çağında; çox tələsik.

**DARMADAĞIN: darmadağın dağıtmaq (etmək)** – 1) tamamilə dağıtmaq, məhv etmək; 2) tamamilə məğlub etmək; 3) *məc.* alt-üst etmək, puça çıxarmaq, puç etmək, dağıtmaq. *Qızın bu sözü yenə də mənim fikrimi darmadağın etdi.* M.S.Ordubadi. **Darmadağın edilmək** – 1) tamamilə dağıdılmaq, məhv edilmək. *Partlayışlar baş verəndən sonra çox böyük bir sahədə torpaq darmadağın edilirdi.* Ə.Sadıq; 2) tamamilə məğlub edilmək; 3) *məc.* alt-üst edilmək, puça çıxarılmaq. **Darmadağın olmaq (dağılmaq)** – 1) tamamilə dağılmaq, alt-üst olmaq. *Onların bizim haqqımızda çəkdiyi planlar özlərinin bizdən yediyi zərbə nəticəsində*

*darmadağın olmuşdu.* M.S.Ordubadi; 2) tamamilə məğlub olmaq. *..Maralan altında duran düşmən qoşunu darmadağın oldu.* M.S.Ordubadi.

**DARTAY** *is. məh. köhn.* Keçmişdə: quyudan neft çəkib çıxarmaq üçün uzunsov vedrə. – *Ata, bu nədir? – deyə, – gözləri işıldayan uşaq soruşdu. – Oğlum, bu, dartaydır.* S.Rəhimov.

**DARTAYÇI** *is. məh. köhn.* Dartayla quyudan neft çıxaran fəhlə.

**DARTAYÇILIQ** *is. məh. köhn.* Dartayçının işi, peşəsi, vəzifəsi. [Comərd] *nəhayət, mədənlərdə çoxdan işləyən köhnə fəhlələrin köməyi ilə Qəssabovun mədənində dartayçılığa girdi.* Ə.Abasov.

**DARTAYLAMA** *məh. köhn.* "Dartaylamaq"dan *f.is.*

**DARTAYLAMAQ** *f. məh. köhn.* Dartayla quyudan neft çıxarmaq.

**DARTƏHƏR** *sif.* Bir qədər dar.

**DARTI** *is.* 1. Dartma, çəkmə; çəkib aparma. ☐ **Dartı qüvvəsi** – 1) heyvanın bir şeyi dartıb çəkmə, çəkib aparma qabiliyyəti, bacarığı, gücü. *Atın dartı qüvvəsi onun çəkisinin təxminən* $^{1}/_{9}$*-nə bərabərdir;* 2) yük heyvanı, qoşqu heyvanı.

2. *dan.* Çəki, vəzn, ağırlıq. *Bu şeyin dartısı 5 kiloqramdan çox olmaz.*

3. *dan.* Üyütmə qabiliyyəti. *Bu dəyirmanın dartısı o qədər yaxşı deyil.*

4. *dan.* Qolac, ölçü. *Bir dartı qədər ip.*

**DARTICI** *is. xüs.* Müxtəlif mexanizmlərin, maşınların və s.-nin bir şeyi dartıb çəkən hissəsi. // Bir şeyi dartıb çıxarmaq üçün alət.

**DARTILI** *sif.* Dartılmış halda olan.

**DARTILMA** "Dartılmaq"dan *f.is.*

**DARTILMAQ** 1. *məch.* Əl və ya başqa bir şeylə tutulub çəkilmək. *Xiyabanı dolduran izdihamın içərisi ilə gedirkən birdən qolumun dartıldığını hiss etdim.* Ə.Sadıq.

2. *t-siz.* Gərilmək, tarım çəkilmək. *Rüstəm kişiyə elə gəldi ki, Qoşatxanın boğazından asılmış qalstuk .. daylaq quyruğu kimi dartılmışdır.* M.İbrahimov. *Birdən təknənin aşağısından bir zəncir dartılır və təknənin alt qapağı açılaraq torpaq platformaya boşalırdı.* Ə.Sadıq.

3. *t-siz.* Yuxarıya doğru çəkilmək. *Qaşları dartılmaq.*

4. *qayıd.* Özünü çəkmək, təşəxxüslə dimdik durmaq.

**DARTILMIŞ** *f.sif.* 1. Tutulub çəkilmiş, tarım çəkilmiş. *Dartılmış zəncir* (*ip*).

2. *məc.* Özünü çəkmiş, təşəxxüslə dimdik ayaq üstə durmuş. *Aralarındakı məsafə dörd addımdan çox olardı. Yanlarında dimdik dartılmış nəzarətçi vardı.* M.Hüseyn.

**DARTIM** *is. xüs.* Gərginlik dərəcəsi, gərilmə dərəcəsi. *Simlərin dartımını ölçmək.*

**DARTINC** *sif.* Tarım dartılmış.

**DARTINMA** "Dartınmaq"dan *f.is.*

**DARTINMAQ** *qayıd.* 1. Özünü geri dartmaq, özünü dala doğru çəkmək; bir şeydən aralanmağa, xilas olmağa, əldən çıxmağa çalışmaq. *Ayı zənciri ilə ayağa dolaşıb dartınır və bağırırdı.* S.S.Axundov. *Tahir, Şeyda İmanovun məngənə kimi qüvvətli əlindən qopmaq üçün nə qədər dartındısa da, qopa bilmədi.* M.Hüseyn.

2. Özünü bir şeyə tərəf çəkmək, meyil etmək.

**DARTIŞDIRILMA** "Dartışdırılmaq"dan *f.is.*

**DARTIŞDIRILMAQ** "Dartışdırmaq"dan *məch.*

**DARTIŞDIRMA** "Dartışdırmaq"dan *f.is.*

**DARTIŞDIRMAQ** *f.* 1. Hərə bir yana dartmaq, tutub, yapışıb çəkmək, hər tərəfdən dartmaq, çəkişdirmək. *Kəndin bir sürü itləri tökülüb üstümə, başladılar məni dartışdırmağa.* Ə.Haqverdiyev. // Dartmaq. *Şəhərin günbatan tərəfindən yerin bağrını yarmış çay qoz ağaclarının qarımış köklərini dartışdırdı.* S.Rəhimov.

2. *məc. dan.* Sorğu-suala tutmaq, çəkişdirmək. *..Bilirəm, arvadın qohum-əqrəbası başıma yığılıb necə dartışdıracaqlar?!* Mir Cəlal.

**DARTIŞMA** *is.* Çəkişmə, dalaşma, güləşmə, çarpışma.

**DARTIŞMAQ** *qarş.* Bir-birini əllə tutub o yan-bu yana dartmaq, çəkmək; dalaşmaq, güləşmək, süpürüşmək, çarpışmaq.

**DARTMA** "Dartmaq"dan *f.is.*

**DARTMAQ** *f.* 1. Bir şeyi əli və ya başqa şeylə tutub özünə tərəf və ya kənara çəkmək.

*Arabaçı atları saxladı, düşdü yerə və başladı atların o qulağından, bu qulağından dartmağa.* C.Məmmədquluzadə. *Həkim qolumdan tutub dartdı..* Mir Cəlal. *Ayaz kəskin bir hərəkətlə atın cilovunu dartdı.* Ə.Məmmədxanlı. // Qapıb almaq. *Əlindən kitabı dartmaq.* – *Rəhim bəy çeki* [Turabın] *əlindən dartıb aldı. Qol çəkdi.* M.Hüseyn. *Söhbət qurtarar-qurtarmaz Gülzar telefonun dəstəsini dartıb müavinin əlindən aldı.* Ə.Əbülhəsən.

2. Zorla çəkmək, özü ilə aparmağa çalışmaq. [Kərimxanı] *dartıb dar koridora çıxardılar.* M.İbrahimov. *Quliyev* [Sultanovu] *evlərinə tərəf dartdı.* Ə.Sadıq.

3. Gərmək, tarım çəkmək. *Yayı dartmaq. İpi dartmaq.*

4. Yuxarıya doğru çəkmək. *..Lakin Mahru yenə də məğrur qaşlarını dartaraq dedi.* M.S.Ordubadi. *Yasavul təəccüblə çiyinlərini dartdı.* S.Rəhimov.

5. Nasos və s. vasitəsilə çəkmək, dartıb çıxarmaq. *Quyulardan neft dartan dərin tulumbaların yeknəsəq səsləri eşidilirdi.* S.Hüseyn.

6. *məc.* "Özünü" sözü ilə – lovğa vəziyyət almaq, təşəxxüslənmək, özünü çəkmək. *Müqim bəy hiyləgərcəsinə özünü dartıb daha da ciddiləşdi.* S.Rəhimov. [Xankişi Haqverdiyə:] *Gəl oyna, özünü dartma, bir görək; Qoy yenə sevinsin, açılsın ürək.* Z.Xəlil.

**DARUQƏ** bax **darğa**. *Qapı açılır, Ağa Kərim, Hacı Rəcəbəli daruqə və yanında dörd nəfər adam daxil olurlar.* M.F.Axundzadə.

**DARÜLELM** *is.* [*ər.*] *klas.* Elm ocağı, elm evi. *Naçalnik cənabları burada bir gün bir darülelm binası qoyar.* C.Məmmədquluzadə.

**DARÜLƏDƏB** *is.* [*ər.*] *klas.* Məktəb. *Darülədəbin bilməliyiz qədrini, millət; İkmalına göstərməli olduqca həmiyyət.* M.Hadi. *Bu, darülədəbdir desə hər kimsə, yalandır.* Ə.Nəzmi.

**DARÜLƏMAN** *is.* [*ər.*] *klas.* Sığınacaq yer, aman gətiriləcək yer, pənah aparılacaq yer, əmin yer, salamat yer. *Qəssabxanaya biz darüləman dedik; Doğru libasın bürünüb min yalan dedik.* M.Ə.Sabir.

**DARÜLFÜNUN** *is.* [*ər.*] Universitet. *..Mirzə Səfərin oğlu darülfünun tələbəsi formasında evlərinə görüşməyə gəldi.* Ə.Haqverdiyev. *Student özünə müvafiq bir ömür sürməkdə idi: səhər darülfünuna, günorta aşxanaya gedər, axşam da dərsləri ilə məşğul olar.* Çəmənzəminli. *Firidun darülfünundan çıxıb evə qayıtdıqda qoca arvad Kürd Əhmədin onu gözlədiyini xəbər verdi.* M.İbrahimov.

**DARÜLMÜƏLLİMAT** *is.* [*ər.*] Qız pedaqoji məktəbinin köhnə adı. *Avqust ayının iyirmi üçündə məlum oldu ki, Zaqatala darülmüəllimatında imtahanlar tezliklə başlanacaqdır.* C.Məmmədquluzadə.

**DARÜLMÜƏLLİMİN, DARÜLMÜƏLLİMEYN** *is.* [*ər.*] Oğlan pedaqoji məktəbinin köhnə adı. *Təqribən Qori darülmüəllimində türk şöbəsinin açılmağı da mənim yaşımın dərsə getmək vaxtına tuş gəlir.* C.Məmmədquluzadə. *1881-ci ildən..* [Qori darülmüəllimində] *tərbiyə almış müsəlman müəllimləri çıxmağa başlayır.* F.Köçərli. [Qəhrəman] *imtahan verib təzə açılan darülmüəlliminə daxil oldu.* S.Rəhimov.

**DARÜRƏKLİ** *sif.* Yalnız öz mənfəətini gözləyən; xudpəsənd, paxıl. *Darürəkli adam.*

**DARÜRƏKLİLİK** *is.* Yalnız öz mənfəətini gözləmə; xudpəsəndlik, paxıllıq.

**DARÜŞŞƏFA** *is.* [*ər.*] *klas.* Xəstəxana, şəfa evi (məcazi mənada işlənir). *Eşqin mərizi-yəm, məni eylər bu qəm həlak; Darüşşəfayi-vəslinə var indi hacətim.* S.Ə.Şirvani.

**DARVAZA** *is.* Əsasən nəqliyyatın keçməsi üçün böyük həyət qapısı; alaqapı. *Dəvəçi ilə dost olanın darvazası gen gərək.* (Ata. sözü). *..Kərbəlayı Cəfər darvazanın səkisində oturub pendir-çörək yeyirdi.* C.Məmmədquluzadə. *Gəzib güclə bir qapı tapa bildim. Bu, sınıq bir darvaza idi.* S.Rəhman. // Qədim şəhərlərin, qalaların hasarındakı böyük qapı.

◊ **Darvazasını (darvazamı) fələk vurmaq** – bədbəxtlik, fəlakət üz vermək, bədbəxt olmaq. *Mirzə Səfər atasının sözlərini əsla eşitməyib qışqırdı: – Darvazamı fələk vurubdur.* Ə.Haqverdiyev.

**DARVAZAÇI** *is.* Darvazanı qoruyan və açıb-bağlayan işçi; qapıçı.

**DARVAZALI** *sif.* Darvazası olan. *Darvazalı həyət. Darvazalı qala. Kəndin iri darvazalı həyətində məktəb binası yüksəlir..*

**DARVİNÇİ** *is.* Darvinizm tərəfdarı. *Darvinçi alim.*

**DARVİNİST** b a x **darvinçi**.

**DARVİNİZM** [ingilis alimi Ç.Darvinin adından] Canlı təbiətin tarixi inkişafı, bütün heyvan növləri və bitki orqanizmlərinin təbii seçim yolu ilə əmələ gəlməsi haqqında nəzəriyyə.

**DARYARPAQ(LI)** *sif. bot.* Ensiz lansetşəkilli yarpağı olan (bitki). *Daryarpaqlı bitkilər.*

**DASİT** *is.* [*lat.*] Maqmatik süxur.

**DASTAN** *is.* [*fars.*] Şifahi xalq ədəbiyyatının epik janrları içərisində qəhrəmanlıq və aşiqanə məzmunda olan, həcmcə ən böyük əsər. *Qəhrəmanlıq dastanı. Aşiqanə dastan. "Koroğlu" dastanı. – Şairə Toğrulun məktubunu aparıb "Xosrov və Şirin" dastanı yazmasını rica edəcəkdir.* M.S.Ordubadi. *Ağlatmayır insanları; "Leyli-Məcnun" dastanları.* S.Vurğun. *El aşıqları incə Azərbaycan dilində xalqımızın mərdliklərini tərənnüm edən ölməz dastanlar qoşurdular.* İ.Əfəndiyev. // Mühüm tarixi hadisələrdən, ya şəxsiyyətlərdən bəhs edən böyük epik əsər; poema. *Zəfər dastanı. – ..Əzəmətli müharibə dastanının əsas mərhələlərindən, ötəri də olsa, bəhs etmək lazımdır. Burada hər bir səhnə böyük bir qəhrəmanlıq dastanı kimi qiymətlidir.* M.Hüseyn. // Hekayə, nağıl, əfsanə, sərgüzəşt. [Koroğlu:] *Ərəb atın dastanını söylərəm; Üç yaşında hər nişanı bəlli olur.* "Koroğlu". [Tərxan:] *Oxuma, ey vəzir, mənə dastan; Qeysərin dağ kimi bir ordusu var.* A.Şaiq. ◻ **Dastan açmaq** – danışmaq, nağıl etmək, rəvayət etmək. *Mən bu körpəyə nə münasibətlə Həcər adını qoymaq istədiyimi soruşduqda, sən aynalını əlinə alan, .. Gorus qazamatını dağıdan Həcərdən dastan açırsan.* S.Rəhimov. **Dastan qoşmaq** – dastan yazmaq, hekayə yazmaq. **Dil(lər)də dastan olmaq** – məşhur olmaq, haqqında tez-tez danışılmaq, dillərə düşmək. [Qərib:] *Ağalar ərzimə bir qulaq verin; Adı dildə dastandır Ərzurumun.* "Aşıq Qərib".

**DASTANÇI** *is.* 1. Dastan söyləyən, hekayəçi, nağıl danışan. *Dastançı aşıqlar.*

2. *məc.* Çoxdanışan, naqqal, uzunçu.

**DASTANÇILIQ** *is.* Dastan söyləmə, hekayəçilik.

**DAŞ** *is.* 1. Təbiətdə parçalar, yaxud böyük və kiçik kütlələr şəklində təsadüf olunan, suda həll olunmayan bərk cisim (süxur). *Küçələrə daş döşəmək. – Bütün izdiham əlinə keçən daş, kəsək parçalarını alovun üstünə yağdırdı..* M.Hüseyn. [Rübabə] *ayağının altındakı sərt qayalara, daşlara, quru kollara, buzlaşmış qumlara baxdı.* Mir Cəlal. // Həmin kütlənin tikinti materialı kimi işlədilən ayrı-ayrı kiçik hissəsi, parçası. *Bir tərəfdə sement, bir tərəfdə daş.* M.Müşfiq. *Rüstəm kişi .. hələ bozaran daşlarına suvaq çəkilməmiş binaya doğru yollandı.* M.İbrahimov. ◻ **Daş kəsmək (çapmaq çıxarmaq)** – iri sal qayalardan tikinti üçün daş doğramaq. *Şirin üçün Bisütundan daş kəsdim; Münasib adamı Fərhad eylədim!* Qurbani. *Belə ki, hansı kənd şurasının adamı haradan haraya işləyəcək, nə qədər iş görəcək, torpaq qaldıracaq, daş çapacaq .. hamısı nəzərə alınmışdır.* S.Rəhimov.

2. Bıçaq və s. itiləmək üçün bülöv, ya daş çarx. ◻ **Daşa çəkmək** – daşda itiləmək.

3. Kitabə, başdaşı, qəbirdaşı. *Ara-sıra ərəb hərfləri ilə yazılan daşlar da nəzərə çarpırdı..* S.Hüseyn.

4. Daşdan qayrılmış, daşdan tikilmiş, daşdan hörülmüş, daşdan yonulmuş. *Daş ev. Daş hasar. Daş pilləkən. Daş körpü.* – [Mehriban] *..qarşısında daş bir heykəl hissizliyi ilə hərəkətsiz duran ərini başdan-ayağa süzdü.* S.Hüseyn. *Birmərtəbəli daş evin pəncərələri taybatay açıq idi.* M.Hüseyn. // Daş döşənmiş, daşla örtülmüş. *Daş küçə. – Ağatlı fayton .. Cavanşir qəsəbəsindən çıxıb daş yolla yuxarı dartındı.* S.Rəhimov.

5. Bəzək üçün işlədilən firuzə, yaqut, almaz, brilyant və s.-yə verilən ümumi ad; daş-qaş. *Sibir daşı. Üzüyün daşı.*

6. Dama, nərd və b. oyunlarda ağac, sümük və s.-dən qayrılmış fiqurlardan hər biri. // Şahmat oyununda: piyadalardan əlavə olan 8 fiqur. *Şah şahmat oyununda əsas daş hesab olunur.* ◻ **Daş-daşa** – şahmat və dama oyununda: heç-heçə qurtarma. **Daşa getmək** – domino oyununda; yerdən əlavə, təzə daş götürmək. *Beş dəfə daşa getdi.*

7. Hesab sayğacındakı dənələrdən hər biri. *Hesabdar bir-birinin arxasınca daha üç daş çəkdi.*

8. Tərəzi daşı. *Birkiloluq daş. – Günbəgündən qocalıb, artmaqdadır mülkü, malı; Düz deyil arşını, ölçüsü, tərəzisi, daşı.* M.Ə.Sabir.

9. *tib.* Bədənin bəzi daxili orqanlarında (məs.: böyrəkdə, qara ciyərdə, öd kisəsində və s.-də) yığılıb daşlaşan maddə. *Qara ciyərdə daş əmələ gəlmək. Böyrəyində daş var.*

10. *məc.* Rəhmsizlik, mərhəmətsizlik, amansızlıq, çox sərtlik, hissizlik mənasında. *Daş ürək.*

11. *məc.* Çox bərk, çox sərt, çox möhkəm şey haqqında (çox vaxt "kimi" sözü ilə). *Əgər daş olsa dözməz xublar bidadına, bilməm; Nə eylər kim, könül bunca cəfavü cövrə tab eylər.* S.Ə.Şirvani. *İçəri atılan daş kimi bərk şeyin nə olduğunu bilmək üçün onu əli ilə axtarıb, nəhayət, tapdı.* A.Şaiq. *Yollar buz bağlayıb, daş kimi bərkimişdi.* M.Hüseyn.

◊ **Daş atıb başını tutmaq** – qəti surətdə danmaq, boynuna almamaq, inkar etmək, rədd etmək. *Mədəd Xanpərini çağırtdırıb əhvalatı öyrənmək istədikdə, Xanpəri, nə təhər deyərlər, daş atıb başını tutdu.* Ə.Vəliyev. **Daş atmaq** – 1) kinayə ilə demək, tənə vurmaq, söz atmaq, sataşmaq. *O, kimə daş atır? – Ay daş atan bəxtəvər, daşın da bir vaxtı var.* (El sözü); 2) əlindən çıxarmaq, axırına çıxmaq. *Var-yoxa daş atmaq. Pullarına daş atdı. – Qalan dövlətinə də İrandan gəlmiş bir dərviş daş atdı.* Ə.Haqverdiyev. **Daş basma(sı), daş çapı** – daş üzərinə salınmış yazıları çap etmə üsulu, litoqrafiya üsulu ilə kitab çapı. *Bu kitabça İrandan gətirilmə daş çapıdır.* F.Ağazadə. **Daş daş üstə qalmamaq** – tamamilə dağılmaq, uçulub yerlə bir olmaq, alt-üst olmaq. *Tullama zəlzələ ilə dönmə zəlzələ birdən olanda daş daş üstə qalmır.* H.Zərdabi. **Daş dövrü (əsri)** *tar. arxeol.* – ibtidai icma quruluşunun, daşdan müxtəlif alətlər hazırlanması ilə səciyyələnən dövrü. *Yazının qədim olmasına sübut daş dövründən tapılmış olan bir çox əsərlərdir.* F.Ağazadə. *Misirdə, Assuriyada və Babilistanda əkinçilik və maldarlıq 6000 il bundan əvvəl kifayət dərəcədə yüksək səviyyədə idi. Avropada isə bu zaman bəşəriyyət daş əsri deyilən səviyyəyə yenicə çatmışdı.* "Ümumi zootexniya". **Daşa basmaq** – daşlamaq, üstünə daş yağdırmaq, daş atmaq. *Axır, mən hara gedim? Uşaqlar məni daşa basır?* C.Məmmədquluzadə. **Daşa dönmək** – 1) bərkimək, daş kimi bərk olmaq; 2) *məc.* ürəyi sərtləşmək, heç bir şeydən mütəəssir olmamaq, təsirlənməmək. **Daşa dönmüş** – ürəyi bərk, sərt, rəhmsiz, şəfqətsiz, mərhəmətsiz adam haqqında. *Daşa dersəm eşidir, sonra verir əks-səda; Daşa dönmüşlərə əks eyləmədi fəryadım.* M.Hadi. *Daşa dönmüşə mənim sözüm təsir etmədi.* Ə.Əbülhəsən. **Daşdan cavab istəmək (axtarmaq)** – çox bərk utanmaq, utandığından deməyə heç bir söz tapmamaq. *Oruc başını aşağı salıb, ayağının yanındakı torpaqdan və daşdan cavab axtardı.* Ə.Vəliyev. **Daşdan keçmək** – çox təsirli olmaq, hər yerdə işə keçmək. *Bu vəsiqə daşdan keçər. – O deyir ki, bir kağız göstərmişəm, daşdan keçər.* S.Rəhimov. **Daşdan yumşaq** – keyfiyyətindən asılı olmayaraq yeyilə bilən hər şey; dişədəyən. *Elə acam ki, daşdan yumşaq nə olsa, yeyəcəyəm.* "Koroğlu". **Daşı daş üstündə qoymamaq** – tamamilə dağıtmaq, darmadağın etmək, dağıdıb viranəyə çevirmək. **Daşı ətəyindən tökmək (atmaq)** – fikrindən daşınmaq, rəyini dəyişmək, görmək istədiyi bir işdən vaz keçmək, höcəti buraxmaq. [Hacı Məhəmmədəli:] *Cənab hakim, gəl sən bu daşı ətəyindən tök!* C.Məmmədquluzadə. *Oğul! Daşı tökün ətəyinizdən; Bir yaxşılıq qalsın dünyada sizdən.* S.Vurğun. *Gəl, lənət şeytana, – deyək, tökək bu daşı ətəyimizdən.* M.İbrahimov. **Daşı sıxsa suyunu çıxarar** – çox güclü, qüvvətli, sağlam adam haqqında. **Daşın böyüyündən yapışmaq, daşın böyüyünü götürmək** – öhdəsindən gələ bilmədiyi, bacara bilmədiyi bir işdən yapışmaq. **Daşını atmaq** – azad olmaq, yaxasını qurtarmaq; əl çəkmək, tərk etmək. *Yeganə bir öküzüm var idi, dünən satdım; Onunla birgə əkinçiliyin daşın atdım.* Ə.Nəzmi. *Əvvəlləri elə fikir edirdim ki, aldığım taxıl məhsulu ilə kasıblığın daşını büsbütün atacağıq.* M.Hüseyn. **Daşlar dilə gəldi** – bir hal, ya hadisənin çox ağır, dözülməz, faciəli ol-

duğunu bildirir. **Bir daş altda, bir daş üstdə** – gizli saxlanmalı, heç kəsə deyilməməli sirr halında. [Piti Namaz] *Mən həyat adı çəkdim burda? Bir sözüydü, bir dəfə demişdim, düzəlmədi, mən də bir daş altdan qoydum, bir daş üstdən.* İ.Məlikzadə. **Bir daşla iki quş vurmaq** – bir dəfə zəhmət çəkməklə iki iş görmək, iki şeyi əldə etmək. **Daş asılmaq** – gec qızmaq, gec qaynamaq. *Samovar qaynamır, deyəsən, altından daş asılıb*. **Oxu daşa toxunmaq** – bərkə düşmək, ciddi maneəyə rast gəlmək, işin baş tutmasına ciddi əngəl çıxmaq. **Özünü daşdan daşa çırpmaq (vurmaq)** – bir şeyi əldə etmək üçün özünü hər cür çətinliyə vurmaq, hər cür çətinlik və məhrumiyyətə məruz etmək. **Üstünə bir daş** – b a x **bir daş altda bir daş üstdə**. **Üstünə daş qoymaq** – sirri gizli saxlamaq, heç kəsə bildirməmək.

**...daş** Bir sıra isimlərə qoşularaq birgəlik, şəriklik bildirir; məs.: yoldaş, sirdaş, silahdaş, məsləkdaş.

**DAŞADÖYƏN** *is. zool*. Sərçələr dəstəsindən uzunquyruqlu kiçik quş; çaydaçapan.

**DAŞADÖYMƏ** *is. məh*. Daşla oynanılan uşaq oyunu.

**DAŞAGİRƏN** *is. məh*. Cəmiyyətdən qaçıb gizlənən adam haqqında.

**DAŞAXOR** *sif.* Daşlıq, çınqıllıq, daşı çox olan. *Daşaxor yer. – İndi də yoncalıq yerində daşaxor bir qumluğa sahib oldun.* S.Rəhimov.

**DAŞARMUDU** *is.* Yumru şəkilli və çox davamlı armud növü.

**DAŞATAN** *is.* Qədim müharibələrdə daş və b. ağır şeylər atmaq üçün işlədilən mancanağa oxşar alət. *Assuriyalılar xüsusi daşatan alətlərlə şəhərə ağır daş parçaları və ya içinə yanan qatran doldurulmuş qablar atırdılar.* “Qədim dünya tarixi”.

**DAŞBADAM** *is.* Bərkqabıqlı badam növü.

**DAŞBAŞ** *is.* 1. *dan. məh*. Çəkinin düzgünlüyünü yoxlamaq üçün onu tərəzinin gah bu, gah da o biri gözündə çəkmək işi.

2. *dan. nifr*. Qeyri-qanuni, əyri yollarla əldə edilən qazanc, gəlir və s. *O, əldə etdiyi daşbaşı bir xəyanət etmədən .. yüzbaşının qabağına sanayır.* S.Rəhimov. *Axı burada daşbaş var*. İ.Əfəndiyev. ☐ **Daşbaş eləmək** – qeyri-qanuni, əyri yollarla pul və s. əldə etmək. *İki kisə daşbaş eləyib satdırmaq və bostanın xeyrindən feyzyab olmaq iştahasında idi.* Mir Cəlal.

**DAŞBAŞÇI** *is. dan. nifr*. Ardıcıl və gizli surətdə, qeyri-qanuni, əyri yollarla qazanc əldə etməyi bacaran və bu işi özünə peşə etmiş adam.

**DAŞBAŞÇILIQ** *is. dan. nifr*. Daşbaşçının işi, peşəsi; qeyri-qanuni, əyri yollarla qazanc və s. əldə etməklə məşğul olma.

**DAŞÇI** *is.* Daşçıxaran, daşyonan usta.

**DAŞÇIXARAN** *is*. Daş karxanasında daş çıxarmaqla məşğul olan fəhlə. *Bakıda ümumiyyətlə, peşəkarlar: bənna, xarrat, dəmirçi, .. daşçıxaran .. və sairə çox olardı.* H.Sarabski. // Sif. mənasında. *Daşçıxaran maşın*.

**DAŞÇILIQ** *is*. Daşçının işi, sənəti. *Daşçılıqda mahir usta.*

**DAŞDƏLƏN** *is. xüs*. Daş dəlmək üçün alət.

**DAŞDIRILMA** “Daşdırılmaq”dan *f.is*.

**DAŞDIRILMAQ** *məch*. Daşmasına səbəb olmaq, daşmasına imkan verilmək.

**DAŞDIRMA** “Daşdırmaq”dan *f.is*.

**DAŞDIRMAQ** *f.* Daşmasına imkan vermək, aşmasına səbəb olmaq. *Samovarın suyunu daşdırmaq. – Südün içində hava çoxdur, ona binaən süd qızanda hava aralanıb südü daşdırır.* H.Zərdabi.

**DAŞ-DİVAR** *top*. Evlər, binalar, tikililər və onların divarları. *Xəzri yeli axşamdan hirs ilə qalxıb, Bakı küçələrinin toz-torpağını daşa-divara çırpırdı.* S.M.Qənizadə. *Hücum yerin dibinə! Hücum dərin göylərə; Hücum deyir daş-divar; Hücum deyir dağdərə.* M.Müşfiq.

**DAŞDOĞRAYAN** b a x **daşqıran**. *Birinci daşdoğrayan mexanizm tamamilə quraşdırılmışdır.* (Qəzetlərdən).

**DAŞDÖŞƏYƏN** *is*. Küçələrə və s.-yə daş döşəyən fəhlə.

**DAŞDÖYƏN** *is*. *xüs*. Daşı xırdalayıb ovan alət, maşın.

**DAŞDUZ** *is.* Daşlaşmış (süxur) halında olan duz.

**DAŞƏPPƏYİ** *is. bot*. Daşların arasında bitən boz rəngli ot bitkisi.

**DAŞGƏRDİŞİ** *is. məh*. Hörülən daş və kərpiclər arasındakı məsafə.

**DAŞXINASI** *is. bot.* Daşların üzərində xal-xal bitən və xına kimi rəng verən bir mamır; yosun; qayamamırı. [Növrəstə və Şahmərdan] *dinclərini almaq üçün şəlalədən bir az kənarda, üzərində sarı-qırmızı daşxınası olan yastı bir qayanın üstündə qoşa oturdular.* Ə.Abasov.

**DAŞXIRDALAYAN** b a x **daşqıran**.

**DAŞIQ** *sif. məh.* Daşınacaq, daşınmalı olan. *Daşıq yük.*

**DAŞIQÇI** *is. məh.* Yük daşıyan fəhlə; hambal, yükçü. *O, daşıqçılara yüklərin ehmallı düşürülməsini tapşırdı.* S.Rəhimov.

**DAŞIQÇILIQ** *is. məh.* Daşıqçının işi, peşəsi. *Daşıqçılıq eləmək.*

**DAŞIMA** "Daşımaq"dan *f.is.*

**DAŞIMAQ** *f.* 1. Bir yerdən başqa bir yerə aparmaq, nəql etmək. *Yük daşımaq. Yeşikləri daşımaq. Daş daşımaq. – Ahıl ilə daş daşı, cahıl ilə bal yemə.* (Məsəl). *Zəhmət bədən üçün lazımdır. Hər kəs daş daşımağı, odun yarmağı özünə layiq bilmirsə, gəzsin, seyr etsin.* H.Zərdabi. *Ey ağalar, düzünü axtarsanız, hökumətin sütunu biz kəndlilərlə o qantər içində yük daşıyan fəhlələrdir.* S.S.Axundov. *Yük maşınları, arabalar taxılları xırmana daşıyırdı.* S.Rəhman.

2. Üstündə olmaq, daim özü ilə saxlamaq, özü ilə bərabər gəzdirmək. *Pasportu cibində daşımaq. Silah daşımaq.*

3. *məc.* Malik olmaq, sahib olmaq. *Onlar eyni familiya daşıyırlar.*

4. *məc.* Bir şeyi təmsil edən, ehtiva edən, özündə cəmləşdirən. *Şairin qoşma və gəraylıları dərin dünyəvi mahiyyət daşıyır.*

5. İfa etmək, yerinə yetirmək. *Məsul vəzifə daşımaq. – Zeynal dövləti müəssisələrin birində orta bir vəzifə daşıyırdı.* S.Hüseyn. *Hərə öz cəbhəsində bir vəzifə daşıyır.* M.Rahim.

**DAŞINDIRMA** "Daşındırmaq"dan *f.is.*

**DAŞINDIRMAQ** *icb.* Daşınmağa məcbur etmək, inandıraraq, yaxud xahiş edərək əl çəkməsinə nail olmaq. *Fikrindən daşındırmaq. – Arvad nə ərini pis yoldan daşındıra bilir, nə oğluna təsir edə bilir.* Ə.Haqverdiyev. *Gülsənəm arvad oğlunu nə qədər fikrindən daşındırmaq istəyirdisə də, heç bir nəticə çıxmayırdı.* M.Hüseyn.

**DAŞINMA¹** "Daşınmaq¹"dan *f.is. Yüklərin daşınması.*

**DAŞINMA²** "Daşınmaq²"dan *f.is. Fikrindən daşınma. – ..Siz onlara bu məqsəddən daşınmaları üçün tələbat verməlisiniz.* M.S.Ordubadi.

**DAŞINMAQ¹** 1. *məch.* Bir yerdən başqa bir yerə aparılmaq, nəql edilmək. *Yüklər daşındı. Taylar gəmiyə daşındı. – Ət bazardan daşınıb mənzilə zənbil-zənbil; Etmədi mədələri yağlı qidanı təhlil.* S.Ə.Şirvani. *Fayton qoşulub balkonun qabağına sürüldü. Bəylə xanımın çamadanı və yol tədarükü daşındı.* Ə.Vəliyev.

2. *qayıd.* Şeylərini başqa yerə daşıyıb aparmaq; köçmək. *Yusif çay vaxtı vədə qoydu ki, Bahadır sabahdan daşınsın.* N.Nərimanov. *Student xanımla vidalaşaraq, iki gündən sonra daşınacağını bildirdi.* Çəmənzəminli. *Baldızımın etirazına və narazılığına baxmayaraq, oraya daşındım.* S.Hüseyn.

**DAŞINMAQ²** *f.* 1. Məqsədindən, fikrindən və ya etmək istədiyi bir işdən və s.-dən vaz keçmək, əl çəkmək (adətən "fikrindən" sözü ilə). *Yeni əlifba fikrindən daşınmaq mənim qüvvəmdən xaricdir.* M.F.Axundzadə. [Mehriban] *axşam çocuqlarını yanına alıb bulvara çıxmaq istəmişdisə də, sonra bu fikrindən nədənsə, daşınmışdı.* S.Hüseyn.

2. Fikirləşmək (çox vaxt "düşünmək" sözü ilə birgə işlənir). *Bəlli Əhməd çox düşündü, çox daşındı.* "Koroğlu". *Qulu Aslan bəydən ayrıldıqdan sonra çox düşündü, daşındı.* A.Şaiq.

**DAŞINTI¹** *is.* Nəqliyyat vasitəsi ilə daşınan şeylər.

**DAŞINTI²** *is.* Daşqın, sel.

**DAŞIRQAMAQ** *f. məh.* 1. Ayağı nalsız heyvanın ayağını daş əzmək. *Heyvan daşırqayıbdır.*

2. *məc.* Yeriməkdən yorulmaq, əldən düşmək.

**DAŞIRMA** "Daşırmaq"dan *f.is.*

**DAŞIRMAQ** *f.* 1. Çox tökərək doldurmaq, daşdırmaq, başından aşınca doldurmaq.

2. Qaynayan şeyin altını çox qalayaraq daşdırmaq. *Südü daşırmaq.*

**DAŞITDIRMA** "Daşıtdırmaq"dan *f.is.*

**DAŞITDIRMAQ** *icb.* Başqasına daşıtmaq, daşıma işi gördürmək. *Qulam müəllim şeyləri daşıtdırıb bir tərəfə yığdırdı..* S.Rəhimov.

**DAŞITMA** "Daşıtmaq"dan *f.is.*

**DAŞITMAQ** *icb.* Bir yerdən başqa yerə apartmaq, nəql etdirmək, köçürtmək. *Yükü daşıtmaq.*

**DAŞIYICI** *sif.* 1. Bir şeyi bir yerdən başqa yerə daşıyan, nəql edən maşın, qurğu, arabacıq, konveyer və s.

2. *tex.* Fəzaya, yaxud uzaqlara uçurulan raketlərin cihazlarla və s. ilə təchiz edilmiş hissəsini müəyyən məsafəyə aparıb çatdıran qurğu. *Birinci peyk və onun daşıyıcı raketi ilk dövrdə təqribən eyni bir orbit üzrə hərəkət edirdi.*(Qəzetlərdən).

**DAŞKA** *is.* [*rus.*] Əl arabası. *Əli Bibiheybət mədənlərində bir dəstə işçi ilə birlikdə daşka çəkir.* M.İbrahimov. // Təkatlı araba.

**DAŞ-KƏSƏK** *top.* Daş və bərkimiş torpaq parçaları. *Onlar yerdən daş-kəsək alıb darvazanı daşa basdılar.* P.Makulu. *İstidən tərləmiş İsmayıl .. cırıq çustlarından çıxan barmağını daş-kəsəyə vurmamaq üçün yolun kənarında bitən otların üstü ilə gedirdi.* S.Şamilov.

**DAŞ-KƏSƏKLİ** *sif.* Çoxlu daş və kəsək olan. *Daş-kəsəkli torpağı qazımaq mümkün deyil. – Daş-kəsəkli yollarla zülmdən qaçaqaça; Qucağında tək balan, qoca Təbrizə gəldin.* S.Rüstəm.

**DAŞKƏSƏN** *sif. xüs.* Tikinti üçün daşları müəyyən ölçüdə kəsən; daşqıran. *Daşkəsən maşın.*

**DAŞQALAQ** *is. tar.* Keçmişdə müttəhimi daşa basmaqla, üstünə daş yığmaqla cəzalandırma üsulu. □ **Daşqalaq etmək** – 1) həmin üsulla cəzalandırmaq; 2) *məc.* çox ağır tənə və məzəmmət etmək, bərk danlamaq, üzərinə lənət yağdırmaq. *Yəqin bil ki, səni daşqalaq edib, mənim də məcmuəmə bilmərrə müştəri olmazdılar.* C.Məmmədquluzadə. *Sevdanın uğursuz o yollarında; Daşqalaq eylədi hər bir kəs məni.* S.Vurğun. *Söyüşlərlə şerini etdilərsə daşqalaq; Lakin sənə döyüşdə oldu məsləkin dayaq.* S.Rüstəm.

**DAŞ-QAŞ** *top.* Qiymətli daşlar, cavahirat (brilyant və s.). *Səadət xanım Gülnazı ətriyyat və daş-qaş dükanlarını gəzdirdi.* M.İbrahimov. *Bu sandıqda yüz min dinar bahasında daş-qaş, cavahirat vardır.* M.Hüseyn.

**DAŞ-QAŞLI** *sif.* Qiymətli daşlarla, cavahiratla bəzədilmiş. *Daş-qaşlı qolbaq.* – [Zərintac xanım:] *Guya ki, dünyanın hansı daş-qaşlı bir tacı bu Müqimciyin çal başından yuvarlanıb göbələk kimi yerə düşübdür!* S.Rəhimov.

**DAŞQƏLBLİ** *sif.* Rəhmsiz, sərt, mərhəmətsiz; ürəyi çox bərk, amansız. *Daşqəlbli insanları neylərdin, ilahi?! Bizdə bu soyuq qanları neylərdin, ilahi?!* M.Ə.Sabir. *Lakin daşqəlbli qaniçən kazaklar, buna baxmayaraq, zavallı işçiləri bacardıqca qılıncdan keçirirdilər.* S.S.Axundov.

**DAŞQƏLBLİLİK** *is.* Rəhmsizlik, mərhəmətsizlik, sərtlik, amansızlıq.

**DAŞQIN** 1. *is.* Sahildən çıxan çay və ya dəniz suyunun qurunu, ətrafı basması; sel. *Güclü yağışlardan sonra çayda daşqın əmələ gəlir.*

2. *sif.* Yatağından kənara çıxan, ətrafı basan; daşmış. *Şux səslərlə dolu isti yuvalar; Daşqın çaylar, durğun göllər bizimdir.* A.Şaiq. *İti axan daşqın çaylar onunla ayaqlaşa bilməyib geridə qaldı.* Ə.Məmmədxanlı.

3. *sif. məc.* Coşqun, güclü, ehtiraslı. [Kərim baba] *..qalın iri dodaqlarında daşqın sevinc qığılcımları uçuşaraq: – Qızılquş, balasını bu səslə çağırır, – dedi.* A.Şaiq.

**DAŞQINLIQ** *is.* Daşqın çayın halı.

**DAŞQIRAN** *is. xüs.* Daşları xırda-xırda doğrayan maşın. *Daşları mexaniki qüvvə ilə hərəkətə gətirən daşqıranlarda qırırlar.* (Qəzetlərdən). // Sif. mənasında. *Daşqıran maşın.*

**DAŞQOVUNU** *is.* Girdə, yaxud yastı şəkildə olan qovun (yemiş) növü.

**DAŞQURAY** *is. məh.* Palçıq və kirəcsiz hörülən alçaq daş divar. *Bağın ətrafındakı daşquray.*

**DAŞLAMA** "Daşlamaq"dan *f.is.*

**DAŞLAMAQ** *f.* 1. Daş atmaq, daşa basmaq, daşla vurmaq. [Qədim:] *Bir də qapımızda sağsağan qırıldasa, daşlayıb qovacağam.* Ə.Haqverdiyev. [Qorxmaz:] *Bu gün böyük bir izdihamın* [Elxanı] *söyərək, lənətlər sovuraraq daşladığını gördüm.* C.Cabbarlı.

2. Bir şeyin üstünü daşla örtmək, üstünə daş döşəmək, yaxud daşla bərkitmək. *Həyəti*

*daşlamaq. Quyunun üstünü daşlamaq.* – [Cahan:] *Heç olmasa, kəndin bir küçəsini də daşlamaq lazımdır.* Ə.Haqverdiyev. *Fərhadoğlu yerindən qalxıb çadırının yan-yörəsini daşladı.* S.Rəhimov.

**DAŞLANDIRMA** "Daşlandırmaq"dan *f.is.*

**DAŞLANDIRMAQ** *f.* Daşdırmaq; axıtmaq. *Kəblə Abbasəli dartındı. Ağzından köpük daşlandıraraq söydü.* Mir Cəlal.

**DAŞLANMA[1]** "Daşlanmaq[1]"dan *f.is.*

**DAŞLANMA[2]** "Daşlanmaq[2]"dan *f.is.*

**DAŞLANMAQ[1]** *məch.* Daşa basılmaq, daşla vurulmaq, üzərinə daş yağdırılmaq. *Məskənimiz sarp qayalar olubdur; Qaçanlar çağrışır, pələng daşlanır.* "Koroğlu".

**DAŞLANMAQ[2]** *f.* 1. Axmaq, tökülmək, daşıb tökülmək, gəlmək. *Qızın ağzından, burnundan bulanıq dəniz suyu daşlandı.* M.Hüseyn. *Kənarlara daşlanan palçıq ötənlərin üstünü bulayırdı.* Mir Cəlal.

2. *məc.* Tökülüşüb gəlmək, axışıb gəlmək.

**DAŞLAŞMA[1]** "Daşlaşmaq[1]"dan *f.is.*

**DAŞLAŞMA[2]** "Daşlaşmaq[2]"dan *f.is.*

**DAŞLAŞMAQ[1]** *f.* 1. Daş halına gəlmək, daşa dönmək, daş kimi bərkimək. *Gil, yer altında uzun zaman qaldıqda daşlaşır.*

2. *məc.* Bərkişmək, sərtləşmək, daşa dönmək. *Ürəyi daşlaşıbdır.*

**DAŞLAŞMAQ[2]** *qarş.* Bir-birinə daş atmaq, bir-birini daşa basmaq. *Uşaqlar daşlaşırdılar.*

**DAŞLATMA** "Daşlatmaq"dan *f.is.*

**DAŞLATMAQ** *icb.* Üstünü daşla örtdürmək, üstünə daş döşətdirmək.

**DAŞLI** *sif.* 1. Daşı olan, çoxlu daş olan; içində daş, daş parçaları olan. *Daşlı torpaq. Daşlı təpə. Bu düyü daşlıdır. – Eləmi daşlı yerlər; Torpaqlı, daşlı yerlər; Bu dünyada hələ var; Gözləri yaşlı yerlər.* (Bayatı).

2. Daş döşənmiş, daşla örtülmüş. *İki böyük qayanın arasındakı daşlı yoldan keçib düzənliyə çatdıqda yolçu oturdu.* S.Rəhman.

**DAŞLI-KƏSƏKLİ** bax **daş-kəsəkli**. *O daşlı-kəsəkli boş səhralarda; Çörək də yetirdik boz səhralarda.* S.Vurğun. *Budur, maşın çətin, daşlı-kəsəkli, sürüşkən dağ yoxuşlarını zorla yuxarı qalxır.* M.İbrahimov.

**DAŞLIQ** *is.* Daş çox olan yer, daşla örtülü yer. *Daş daşlığa yağar, dolu dəryaya.* (Ata. sözü). *Atlar .. Kür sahilindəki daşlığın xəlvət bir yerində söyüd ağaclarına bağlanmışdı.* M.Hüseyn. *Dərinlərə düşmüş dərə ağ daşlıq və çınqıllıq üzrə uzanıb gedirdi.* S.Rəhimov. // *sif.* Daş çox olan, daşla örtülü. *Daşlıq yer. Daşlıq çöl. – Daşlıq yolun kənarlarında ot-ələf elə ucalmışdı ki, deyərdin, buralar xüsusi biçənək yeridir.* Mir Cəlal.

**DAŞMA[1]** "Daşmaq"dan *f.is. Çayın daşması. Samovarın daşması.*

**DAŞMA[2]** *is. aşp.* Düyüsünün suyu süzülmədən bişirilən plov; dəmyə. *Daşma bişirmək.*

**DAŞMAQ** *f.* 1. Kənarlarından çıxaraq ətrafı basmaq (su haqqında). *Kür daşmışdır. – Bulandı dəryalar, həm daşdı sular; Qaynaqsız bulaqlar çaya dönübdür.* Qurbani. *Çaylar daşıb sel olsun; Taxıllar tel-tel olsun.* M.Ə.Sabir.

2. Qabın tutumundan çox olduğuna görə kənarlarından aşıb tökülmək. *Qoyun, quzu bir-birinə qarışar; Qulplu qazanlardan qatıqlar daşar.* S.Vurğun. // Bərk qaynayaraq köpüb, qabarıb qabın kənarlarından axıb tökülmək (mayelər haqqında). *Süd daşır. Samovar daşdı.*

3. *məc.* Bir şeyin çoxluğunu, bolluğunu bildirir (bu mənada çox vaxt "aşıb-daşmaq" şəklində işlənir).

4. *məc.* Coşmaq, qızışmaq, hiddətlənmək, son dərəcə acıqlanmaq (bəzən "coşub-daşmaq" şəklində işlənir). *Şişman adam coşdu-daşdı, ağzı köpüklənərək: – Bu sözün sənə neçəyə mal olacağını bilmirsən,* – [dedi] A.Şaiq. // Hədəqəsindən oynamaq (göz haqqında). *O həddindən artıq acıqlandı, qan piyaləsinə bənzəyən gözləri daşmağa başladı.* M.S.Ordubadi.

**DAŞMALIQ** *sif. aşp.* Daşma[2] bişirmək üçün yararlı. *Daşmalıq düyü.*

**DAŞMİŞARLAYAN** *is.* Daşları mişarlayıb müəyyən əndazəyə salan işçi.

**DAŞNAK** [*erm.*] XIX əsrin 90-cı illərində meydana gəlmiş millətçi-terrorçu erməni "Daşnaksütyun" partiyasının üzvü. *Daşnak quldur birləşmələri. Antanta ölkələri də daşnakların əməllərindən narazılıqlarını bildirirdilər. "Böyük Ermənistan" xülyalarından əl çəkməyən daşnak quldur bir-*

*ləşmələri Naxçıvan, Zəngəzur və Qarabağ qəzalarının azərbaycanlı əhalisinə qarşı məqsədyönlü soyqırımı və etnik təmizləmə aparırdılar.*

**DAŞOYNADAN** *is*. Daşlarla gimnastik hərəkətlər göstərən ağır atletika idmançısı. *Daşoynadanların yarışı.* // Sif. mənasında. *Daşoynadan pəhləvan.*

**DAŞ-TƏRƏZİ** *top.* Çəki ləvazimatı (tərəzi və daşları). [Araz dedi:] *..Əli əsə-əsə daş-tərəzi tutan adamın bu sözlərinə inanmaram.* A.Şaiq.

**DAŞTÜLƏK** *is.* 1. Vəhşi, vəhşi böyümüş, ələ öyrədilməsi çətin olan qırğı.

2. Qoşquya getməyən, yoldaşı ilə qoşa, yan-yana çəkməyən at.

3. *məc*. Sital, üzlü, sırtıq, həyasız (adam).

**DAŞÜRƏKLİ** bax **daşqəlbli**. *Daşürəkli adam. – Mən ancaq onu bilirəm ki, arvad nə qədər daşürəkli də olsa, onu yola gətirmək olar.* N.Vəzirov. *Nişan alıb ox atmağı, nə çarə; Daşürəkli mələklərdən öyrəndim.* M.Müşfiq.

**DAŞÜRƏKLİLİK** bax **daşqəlblilik**.

**DAŞYONAN** *is.* Tikinti üçün daşları yonub müəyyən şəklə və ölçüyə salan usta. *Hər namuslu vətəndaş bizim eldə əzizdir; Alim, kuryer, daşyonan, toxucu qadın, əsgər.* R.Rza.

**DAVA**[1] *is.* [*ər.*] 1. Dalaşma, söyüşmə; çarpışma, vuruşma. *Artıq bu səfər heç bir zor, heç bir dava kar eləmədi.* S.Rəhman. ☐ **Dava axtarmaq** – heç bir şey üstə dava etməyə çalışmaq, dava etmək üçün bəhanə axtarmaq. [Səlimnaz xanım:] *Sən bu gün aşkara dava axtarırsan.* N.Vəzirov. **Dava qalxmaq (düşmək)** – dava baş vermək. **Dava eləmək** – 1) savaşmaq, dalaşmaq, söyüşmək, vuruşmaq. [İsmayıl bəy:] *Mən bura dava eləməyə gəlməmişəm.* N.Vəzirov; 2) mübahisə etmək. **Dava salmaq** – aranı vuruşdurmaq, dava düşməsinə səbəb olmaq.

2. Müharibə. *Barıt və qan qoxusu ağırlaşdı havada; Daşlar belə qanadı bu uğursuz davada.* R.Rza. *Əsgəran davasında basılmaq xəbəri bütün yaylağı kədər və vahiməyə salmışdı.* Mir Cəlal. *Sonra dava düşdü, çevrildi dünya; Bunu məndən gözəl siz bilirsiniz*. M.Müşfiq.

3. Həlli tələb olunan məsələ, mübahisəli məsələ; münaqişə; iddia. *Aradakı davanı həll etmək. Onun davasına baxmaq.* – [Eyvaz:] *...Bizim davamız millət davası deyil, çörək davasıdır, azadlıq davasıdır.* C.Cabbarlı. ☐ **...davası etmək** – ..iddia etmək, ..üstündə mübahisə etmək, ..tələb etmək. [Qafar:] *Sən mənimlə paltar davası edirsən, eləmi?* S.S.Axundov.

4. *köhn. hüq*. Müdafiə üçün məhkəməyə müraciət, qarşı tərəfi məhkəməyə cəlb etmə, məhkəmə hüzurunda baxılan iş; mühakimə. ☐ **Dava çəkmək** – məhkəmədə çəkişmək, məhkəməyə müraciət etmək, məhkəmədə iş açmaq. [Səlimə xanım:] *Gərək indi dava çəkməyə məcbur olam.* M.F.Axundzadə.

◊ **Dava dağarcığı** – davakar adam haqqında.

**DAVA**[2] *is.* [*ər.*] 1. Dərman. *Aptekdən dava almaq.* – [Nurcahan:] *Başına dönüm, həkimbaşı, bu suyu bir baytal verib mənim azarlıma, nəvəmə dava adına...* N.Vəzirov. *Aptekdən təzə dərman gətirmişdilər. Haman dava mənə çox kömək edirdi.* C.Məmmədquluzadə.

2. *məc*. Çarə, tədbir, əlac mənasında. *Sən də gəl, yadıma sal, deyək, bəlkə qoyunların qızdırmasına bir dava deyə.* C.Məmmədquluzadə. ☐ **Dava etmək (eləmək)** – müalicə etmək. *Xəstəyə dava etmək.*

**DAVACAT** *top.* [*ər.*] 1. Dava-dərman, dərmanlar. [İbrahim:] *Bu dükanda .. davacat və qeyri ticarət şeyləri də var idi.* S.S.Axundov. [Həkim:] *Bəzi para davacat və cihazlar da gətirmişəm.* S.Rəhimov.

2. *məc. dan.* İçki mənasında. *Mikayıl, bu süfrədə davacat görməyirəm, yoxsa hacı evində davacat olmaz?* N.Vəzirov.

**DAVACATXANA** *is.* [*ərəbcədən* davacat və *fars.* xanə] *köhn.* Aptek, dərmanxana.

**DAVACIL** bax **davakar**. *Davacıl adam.*

**DAVAÇI** *is.* Dava-dərman hazırlayan və satan adam. *Səttarxandan sonra Əli davaçı danışmağa başladı.* P.Makulu.

**DAVAÇI** 1. *sif.* Bax **davakar**. *Davaçı adam. Davaçı qonşu.*

2. *is.* Biri ilə davalı işi olan. *Məhkəmədə davaçının dindirilməsi.*

**DAVA-DALAŞ** *is.* bax **dava**[1] 1-ci mənada. *Daha burada hərb meydanını müfəssəl təsvir etməyin lüzumu yoxdur. Çünki cəmi müsəlman qardaşların başı dava-dalaş çəkib, hamı vuruşma görüb.* Çəmənzəminli. *Belə ki baxardın, hər gün sərxoş bəyin qapısında dava-dalaşdır.* S.Rəhimov. [Kənddə] *həmişə dava-dalaş əskik olmazdı.* Ə.Sadıq. ☐ **Dava-dalaş salmaq** – dava etmək, dava salmaq, qalmaqal salmaq. [Şamxalın] *..anası həmişə kişinin üstünə düşüb dava-dalaş salar, ağlayıb-sızıldayar, sonra da sakitləşərdi.* İ.Şıxlı.

**DAVA-DAVA** *is.* Uşaqların oynadığı vuruşma, döyüşmə oyunu. *Dava-dava oynamaq.* ☐ **Dava-dava demək (vurmaq)** – dava etməyə, vuruşmağa bəhanə axtarmaq; dava etməyə, vuruşmağa hazır olmaq.

**DAVA-DƏRMAN** *is.* [*ər.* dəva və *fars.* dərman] Dərman. [Cəvahir xanım:] *İndi, elə bu saat Əşrəf dava-dərman gətirəcək.* N.Vəzirov. [Həkim:] *Dava-dərman yazmaq istədikdə* [qızın] *atası qolumdan tutub eşiyə tərəf çəkdi.* Mir Cəlal. ☐ **Dava-dərman etmək (etdirmək eləmək elətdirmək)** – müalicə etmək (etdirmək). *Nə qədər Usta Cəfərə dava-dərman elətdirdim, başa gəlmədi.* C.Məmmədquluzadə. **Dava-dərman olmaq** – müalicə olunmaq. *Gərək bu tezliklə sənə dava-dərman olsun, qoca!* S.Rəhimov.

**DAVA-DÖYÜŞ** bax **dava-dalaş**.

**DAVAXANA** *is.* [*ər.* dava və *fars.* ...xanə] bax **davacatxana**. *..Bir adam davaxanaya girib: – Hacı ağa əmi, sizsinizmi? – deyə soruşdu.* P.Makulu.

**DAVAKAR** *sif.* [*ər.* dəva və *fars.* ...kar] Hər şeydən ötrü dava edən, dava axtaran, dava salan. *Davakar adam.* – [Qəmər:] *Nə yaman davakar olmuşsunuz, Yusif?* S.Rəhman. [Fərəc bəy] *..çox kobud, olduqca söyüşcül, dedikcə davakar imiş.* Ə.Vəliyev.

**DAVAKARLIQ** *is.* Davakar adamın xasiyyəti; dava etmək xasiyyəti; dava salma. *Böyləcə dava etməzin hər vəqt; Davakarlıqda tapmışam şöhrət.* A.Səhhət. ☐ **Davakarlıq etmək** – heç şeyin üstündə dava etmək; dava axtarmaq.

**DAVA-QALMAQAL** bax **dava-dalaş**.

**DAVALAMA** "Davalamaq"dan *f.is.*

**DAVALAMAQ** *f.* Dərmanlamaq, dərman səpmək, dərman vurmaq. *Yaranı davalamaq.*

**DAVALANMA** "Davalanmaq"dan *f.is.*

**DAVALANMAQ** *məch.* Dərmanlanmaq, dərman səpilmək, dərman vurulmaq.

**DAVALATMA** "Davalatmaq"dan *f.is.*

**DAVALATMAQ** *icb.* Dərmanlatmaq.

**DAVALI** *sif.* 1. Davaya, mübahisəyə səbəb ola bilən; qalmaqallı, mübahisəli, münaqişəli. *Davalı məsələ. – Davalı yerdə ot bitməz.* (Ata. sözü).

2. Küsülü. *Onlar davalıdırlar.*

**DAVALI** *sif.* Dərman olan, əlacı olan, müalicəsi mümkün olan. *Davalı dərd. Davalı xəstəlik.*

**DAVA(LI)-ŞAVALI** bax **davalı**.

**DAVA(SIZ)-ŞAVASIZ** bax **davasız**. *Belə bir padşah tapılsa, davasız-şavasız hər şey düzələr.* "M.N.lətif.". [Hacı] *fikirləşdi ki: "Hamısı birdir, toy olanda Qumru köçəcək, davasız-şavasız həyat özümə qalacaq".* Mir Cəlal.

**DAVAM** *is.* [*ər.*] 1. Dözüm, möhkəmlik, taqət, tab; müqavimət qabiliyyəti. *Onun soyuğa heç davamı yoxdur. – Dərdə kimin vardır mən tək davamı; Eşqin mərəziyəm, sən ver davamı.* M.F.Axundzadə. *Var atanın sənə dua, səlamı; Hicranına yoxdur daha davamı.* A.Səhhət.

2. Bir şeyin, işin və ya hadisənin daimi və ya müəyyən müddətli olması. *..Biz başımıza həmişəlik doğru və sadiq oxucu cəm etmişik, bu, hələlikdə bizə kifayətdir və buna isbat məcmuəmizin davamıdır.* C.Məmmədquluzadə. ☐ **Davam etdirmək** – başlanmış bir işi eyni qayda və ardıcıllıqla fəaliyyətdə saxlamaq, inkişaf etdirmək. *"Kəşkül" "Əkinçi"nin yolunu davam etdirərək, öz səhifələrində gerilik əleyhinə kəskin məqalələr dərc edirdi.* M.İbrahimov. [Mingəçevirə] *gedənlər işləməklə bərabər, təhsillərini davam etdirə bilərlər.* Ə.Sadıq. **Davam etmək** – 1) dözmək, tab gətirmək, müqavimətə və s.-yə qarşı dayanmaq. [Hacı Bayram:] *Axır vətəndən uzaqda davam eləyə bilməyib gəlmişəm.* Ə.Haqverdiyev. [Nəbi:] *Vallah, mən nökər belə rahatsızlığa davam edə bilmirəm.* S.S.Axundov. *Ana deyir: – Darıxma,*

*qızım, dərdə et davam.* M.Seyidzadə; 2) bir şeyin üzərində möhkəm durmaq, səbat göstərmək. *Öz fikrində davam etmək;* 3) arasıkəsilmədən sürmək, əvvəlki halında qalmaq, fəaliyyətdə olmaq, təsirini, gücünü, şiddətini olduğu kimi saxlamaq. *Yağış iki gündür davam edir. Soyuqlar çox davam etmədi. – Usta Ağabalanın ürəyində cinlərin qorxusu hələ davam edirdi.* Çəmənzəminli. *Fəhlələrin bir həftə əvvəl başlanmış tətili hələ də davam edirdi.* M.Hüseyn. // Başladığı bir işin arasını kəsməmək, dayandırmamaq. [Səlim bəy:] *..Geri çəkilmədim. Atışmada davam etdim.* S.S.Axundov. – [Şamxal] *..Papiros eşib yandırdı. Dalbadal sümürüb tüstünü kənara üfürdü, yenə fikrinə davam etdi.* İ.Şıxlı. **Davam gətirmək** – b a x **davam etmək** 1-ci mənada. *Sərçələr belə qışa davam gətirə bilmirdilər.* S.S.Axundov. **Davam gətirməmək** – tab etməmək, dözə bilməmək. *Ağ atın ayaqları yerə dəyməyir və qabağında heç bir qüvvə davam gətirməyir.* Ə.Haqverdiyev.

**DAVAMÇI** *is.* Öz sələfinin işini, fəaliyyətini davam və inkişaf etdirən adam. *Vaqif yolunun davamçısı olan Zakir şerimizə həqiqi satira gətirmişdir.* A.Şaiq.

**DAVAMETDİRİCİ** b a x **davamçı**.

**DAVA-MƏRƏKƏ** *is.* [*ər.*] b a x **dava-dalaş**. *Dəxi bundan savayı heç bir dava-mərəkə lazım deyil.* C.Məmmədquluzadə. ☐ **Dava-mərəkə salmaq** – b a x **dava salmaq** (**"dava"**da). *Müsəlman təzədən evlənmək istəsə, evlənəcək və heç vecinə gəlməyəcək ki, övrəti dava-mərəkə salacaq.* C.Məmmədquluzadə.

**DAVAMİYYƏT** *is.* [*ər.*] *köhn.* Davametmə müddəti, davametmə qabiliyyəti; davamlılıq.

**DAVAMLI** *sif.* 1. Hər cür çətinliyə, məşəqqətə, məhrumiyyətə, əzab və əziyyətə davam gətirən; dözümlü. *O, çox davamlı adamdır. İstiyə davamlı ürək.* ☐ **Davamlı olmaq** – dözmək, möhkəm olmaq, səbat etmək. *Hər bir əziyyətə və məşəqqətə qarşı davamlı olmaq lazımdır.* – [Sabir haqqında] *İnsan çox davamlı olur: ata ölümünə, qardaş, oğul, qız ölümünə bir növ davam etmək mümkündür. Amma rəfiq ölümünə davam etmək çətindir.* Ə.Haqverdiyev.

2. Çətin dağılan, gec yırtılan, çox möhkəm. *Davamlı parça. Davamlı çəkmə.*

3. Etibarlı, sarsılmaz, möhkəm, səbatlı. *Hər halda möhkəm və davamlı ittihad məhz fəhm və bəsirət yolu ilə olan ixtilafdadır...* C.Məmmədquluzadə. *Dedim: – Daşmı davamlıdır, yoxsa onun iradəsi?* M.Rahim.

4. Uzun sürən, sürəkli, arası kəsilməyən, ardıcıl. *Bu zaman vağzala girməkdə olan bir maşının davamlı fit səsi eşidildi.* M.İbrahimov. *Ağır gövdə yerə dəyəndə yazıq, davamlı bir uğultu səsi gəldi.* Mir Cəlal.

**...davamlı** *xüs.* Bəzi mürəkkəb sifətlərin ikinci tərkib hissəsi; məs.: odadavamlı, soyuğadavamlı, istiyədavamlı.

**DAVAMLILIQ** *is.* Davamlı şeyin hal və xassəsi; dözümlülük, möhkəmlik. *Parçanın davamlılığı. İnsanın soyuğa davamlılığı artdıqca soyuqdəymə xəstəliklərinə tutulma imkanı azalır. İdmanda davamlılıq əsas şərtlərdəndir.*

**DAVAMSIZ** *sif.* 1. Davamı, dözümü olmayan, müqavimət edə bilməyən. *Soyuğa davamsız bitkilər.* // Zəif, dözümsüz. *Davamsız adam.* – [Qızıl Arslan:] *Dünyada padşahlığın taxtından da çürük və davamsız şey yoxdur.* M.S.Ordubadi.

2. Möhkəm olmayan, tez dağılan, tez yırtılan, tez xarab olan. *Davamsız parça. Davamsız dəri. – O vaxt ki, kənd uzaqda qalmışdı, sinəsində bir zümzümə başlanmışdı və .. bu zümzümə elə bil toxunmaqda olan bir xalçanın çox davamsız iplikləri idi ki, tez-tez qırılırdı.* Ə.Məmmədxanlı.

3. Çox davam etməyən, çox sürməyən, tez keçib gedən, sürəksiz. *Davamsız yağış. Davamsız qar.*

**DAVAMSIZLIQ** *is.* Davamsız şeyin hal və keyfiyyəti. *Qarın davamsızlığı. Paltarın davamsızlığı.* // Dözümsüzlük. *Ağrıya davamsızlıq.*

**DAVAR** *is.* Qoyun-keçi; xırdabuynuzlu mal-qara. *Kəndin gözəl davarını; Parçalayan, yeyən budur, "Mənəm – mənəm!" deyən budur.* M.Müşfiq. [Mübaşir Məmməd:] *..On ildir ərbabın su pulunu vermirsən! İnəyi də, eşşəyi də, davarları da çıxart çölə!* M.İbrahimov.

**DAVARÇILIQ** *is.* Davar yetişdirmə işi.

**DAVARLI** *sif.* Davarı olan.

**DAVASIZ¹** *sif.* Dərmansız, əlacsız; çarəsi, əlacı, müalicəsi olmayan. *Davasız dərd. – Onun gövdəsinə daraşan yara; Təbibsiz, davasız simlər atmışdır.* S.Vurğun.

**DAVASIZ²** *sif.* və *zərf* Qalmaqalsız, mübahisəsiz, sakit. *Davasız, tüfəngsiz bircə gecədə; Sahili sahilə çata bilərdim.* M.Araz.

**DAVASIZ-DALAŞSIZ** bax **davasız²**.

**DAVASIZ-DƏRMANSIZ** bax **davasız¹**.

**DAVASIZLIQ** *is.* Dərmansızlıq, əlacsızlıq; davası-dərmanı olmama.

**DAVASIZ-ŞAVASIZ** bax **davasız²**.

**DAVA-ŞAVA** bax **dava-dalaş**. *Bütün dünyadan padşah tayfası, bəy, xan, böyük varlılar götürüləndən sonra, yəqin ki, dava-şava da olmayacaq.* S.Rəhimov. *Kitabda yazılan sevgilərin axırı dava-şava olur.* İ.Əfəndiyev.

**DAVAT** *is.* [*ər.*] *köhn.* Mürəkkəbqabı. *Bulud havada gedər; Qələm davata gedər.* (Bayatı). *..Davat və qələmimdən başqa, heç bir şeyə gümanım gəlmir.* M.F.Axundzadə. *Molla ağzının suyundan bir damla davata damızdırıb qarışdırdıqdan sonra yazmağa başladı.* A.Şaiq.

**DAVLA** *is.* 1. *mus.* Xərək (musiqi alətlərində simlərin altına qoyulan taxta parçası).

2. *zool.* Cırcırama.

**DAVRANIŞ** *is.* Davranma tərzi; hərəkət, rəftar. *Gənc qızın hərəkət və davranışlarından onun qəlbindəki həyəcanları aydıncasına oxuyurdum.* M.S.Ordubadi. *Boğur varlığımı rəsmi davranış; Bir yol mənimlə gəl mehriban danış.* M.Rahim.

**DAVRANIŞLI** *sif.* Yaxşı rəftarı, davranışı olan; xoşrəftar.

**DAVRANMA** "Davranmaq"dan *f.is. Siqətülislam, inqilabda bitərəf davranmasına baxmayaraq, məşrutəçilərin tərəfini saxlamaqda idi.* M.S.Ordubadi.

**DAVRANMAQ** *f.* Özünü aparmaq, münasibət bildirmək. *Təbriz inqilabçıları çox ehtiyatlı davranmalıdırlar.* M.S.Ordubadi. *Mən nə qədər ki ..* [Xədicəyə] *qarşı laqeyd və etinasız davranırdım, əksinə olaraq, o mənə bir o qədər artıq təmayül göstərir, bəzən üzüaçıq gəlib yanımdan ötərək gedirdi.* S.Hüseyn. *Sarxan çox diqqətli və olduqca sayıq davranırdı.* M.Hüseyn.

**DAVUL** *is. mus.* İki tərəfinə dəri çəkilmiş, xüsusi ağacla vurularaq, güclü səs çıxaran zərbli musiqi aləti; təbil. *Vur, çatlasın davulu; Topla eli, avulu; Oynat qızı, oğulu; Bir qardaş deyilmiyik?* Ə.Cavad. *Toyda vurulan davul səsləri dağları tərpətmişdi.* S.Rəhimov.

**DAVULÇU** *is.* Davul çalan adam.

**DAVUŞ** *is. məh.* Tappıltı, ayaq səsi.

**DAY¹** *is.* Biryaşar at balası, dayça. *Day at olunca, yiyəsi mat olar.* (Ata. sözü). *Qarabağda nə day qaldı, nə dana; Bu gün, sabah hərə qaçar bir yana.* Q.Zakir. *Daylar tullanıb düşür, bir-biri ilə oynayırdılar.* İ.Əfəndiyev.

**DAY²** *dan.* "Daha" sözünün ixtisarı. [Koroğlu:] *Bacını aparmaq istəyirsən, gəl apar, day söyüş niyə söyürsən?* "Koroğlu". *İbrahim padşahın gözünə çox xoş gəlmişdi. Day lap hayıl-mayıl olmuşdu.* (Nağıl).

**DAYA** bax **dayə**. *Bir tərəfdə Şəhrəbanu xanım oturubdur, bir tərəfdə Şərəfnisə xanım, bir tərəfdə onun dayası Xanpəri.* M.F.Axundzadə.

**DAYAQ** *is.* 1. Binanın və s.-nin sınmış pərdilərini, yaxud uçulan divarı və s. saxlamaq, eləcə də meyvəsi çox olan ağac budaqlarını sınmaqdan qorumaq üçün onların altına vurulan ağac, dəstək və s. *Barıya dayaq vurmaq. – Nurcabbarın həyətində .. ağaclar bar gətirəndə altdan dayaq verməsən, budaqlar əyilib burnunu yerə döyür.* İ.Məlikzadə.

2. Üzərində bir şey bərkidilmək, yaxud qurğu qurula bilmək üçün düzəldilmiş yer, özül; dəstək ola biləcək hər şey. *Körpü dayaqları. Ayaqları dirəmək üçün qayıqda dayaq yoxdur. – Qoca Xudafərin qulağı səsdə; Kim uçan tağına dayaq düzəldər?* M.Araz.

3. *məc.* İstinad ediləcək adam, şey; kömək, arxa, himayəçi. *Ailənin dayağı. – Ömrümün çırağı, canımın dayağı, könlümün sorağı, baxtımın gülüstanı Ruqiyyə idi, Ruqiyyə!* A.Divanbəyoğlu. *Ana ürəyidir insana dayaq; Odur bərk ayaqda çatan köməyə.* S.Rüstəm. ◻ **Dayaq durmaq** – bax **dayaq olmaq**. *Sən bilirsən ki, adamı darda atmazlar, yıxılana dayaq durarlar.* S.Rəhimov. **Dayaq olmaq** – kömək olmaq, arxa olmaq, müdafiə etmək, himayə etmək, dalında dur-

maq. *Qəmər mənə böyük bir dayaq ola bilərdi.* M.İbrahimov. **Dayaq vermək** – ürək vermək, ruhlandırmaq, ürəkləndirmək. *Özünə dayaq vermək.*

**DAYAQLAMA** “Dayaqlamaq”dan *f.is.*

**DAYAQLAMAQ** *f.* Dayaq vermək, altına dayaq qoymaq.

**DAYAQLANMA** “Dayaqlanmaq”dan *f.is.* *Ağacların dayaqlanması.*

**DAYAQLANMAQ** *məch.* Dayaq verilmək, altına dayaq qoyulmaq.

**DAYAQLI** *sif.* 1. Dayağı olan. *Dayaqlı ağac.*

2. *məc.* Köməkli, arxalı; himayəçisi, arxası, köməyi olan. *Dayaqlı adam.*

**DAYAQLIQ** *sif.* Dayağa yarayan. *Dayaqlıq tir. Dayaqlıq ağac.*

**DAYAQSIZ** *sif.* 1. Dayağı olmayan.

2. *məc.* Köməyi, arxası olmayan.

**DAYAQSIZLIQ** *is.* Köməyi, arxası olmama, dayağı olmama.

**DAYALIQ** b a x **dayəlik**.

**DAYAMA** “Dayamaq”dan *f.is.*

**DAYAMAQ** *f.* 1. Dirəmək, söykəmək, kip yanaşdırmaq (yaxınlaşdırmaq). *Nikitin dodağını lap Aslanın qulağına dayadı.* M.İbrahimov. *Mən ulduzsuz, qaranlıq göylərə baxar, baxar; Alnımı buz bağlayan pəncərəyə dayardım.* Ə.Cəmil.

2. Dayaq vermək. *Axırda elçi əllərini buynuz kimi tutaraq gicgahlarına dayayıb, özü də öküz kimi böyürür.* “M.N.lətif.” *Balacayev əlini stola atıb güclə ayağa qalxdı, qapı kilidli idi. O gicəldi, əlini alnına dayadı.* S.Rəhimov.

**DAYANACAQ** *is.* 1. Sərnişinlərin düşməsi və minməsi üçün tramvayın, avtobusun və s.-nin dayandığı yer. *Tramvay dayanacağı. Avtobus dayanacağı.*

2. Müvəqqəti yaşamaq üçün düzəldilən yer. *Ov heyvanları bol olan sahələrdə ən qədim insanlar özlərinə dayanacaqlar düzəldirdilər.*

3. Söykənəcək, dayaq. *Əl ağacı qoca adam üçün ən yaxşı dayanacaqdır.* // Əl ağacı.

4. *məh.* Araba oxunun, təkəri oxdan çıxmağa qoymayan və arabada laydırı dik saxlayan hissəsi. *Arabanın dayanacağı.*

**DAYANDIRICI** *sif.* Kəsən, dayandıran, inkişaf etməyə qoymayan.

**DAYANDIRILMA** “Dayandırılmaq”dan *f.is.*

**DAYANDIRILMAQ** “Dayandırmaq”dan *məch. Bu küçədə hərəkət dayandırılmışdır. Hərbi əməliyyat dayandırıldı. – Bir azdan sonra çay və qəlyan dayandırıldı.* M.S.Ordubadi. *1891-ci ildə “Kəşkül”ün də nəşri dayandırılır.* M.İbrahimov.

**DAYANDIRILMAZ** *sif.* Dayandırıla bilməyən, qabağı saxlanıla bilməyən.

**DAYANDIRMA** “Dayandırmaq”dan *f.is.*

**DAYANDIRMAQ** *f.* 1. Dayanmağa, durmağa məcbur etmək, ayaq üstə saxlamaq. *Vahidin özünü də çağırıb müttəhim kimi qapı ağzında xeyli dayandırdılar və sonra dindirdilər.* Mir Cəlal.

2. Bir şeyin hərəkətini, gedişini, inkişafını müvəqqəti və ya həmişəlik saxlamaq. *Zavodun işini dayandırmaq.* // Əyləmək, gedərkən saxlamaq, durdurmaq. *Qatarı dayandırmaq. Avtobusu dayandırmaq. Avtomobili dayandırmaq. – Tapdıq Mayisi və onun əlindəki dəftərləri görən kimi maşınını dayandırdı.* Ə.Vəliyev.

3. Bir işi daha görməmək, nəhayət vermək, davam etdirməmək, kəsmək. *Müzakirələri dayandırmaq. Danışıqları müvəqqəti dayandırmaq. Hücumu dayandırmaq. Atəşi dayandırmaq. – Tətil etməyən zavodlardan bir çoxunu təhdidlə dayandırdılar.* M.S.Ordubadi.

4. Kəsmək, tamam azaltmaq. *Diş ağrısını dayandırmaq. Qanı dayandırmaq. – Çay ən yaxşı tərlədici vasitədir, bundan başqa, baş ağrısını dayandırır.* B.Talıblı.

5. Sözünü kəsmək, danışığını davam etdirməyə qoymamaq. *Danışanı dayandırmaq yaxşı deyil. – Alqış səsləri natiqi dayandırırdı.* Mir Cəlal.

**DAYANIQ** *is.* 1. Davam, davamlılıq, möhkəmlik dərəcəsi, sürək. *Dayanığı olmayan parça.*

2. Dözüm, səbat, səbir. *Onun heç dayanığı yoxdur. İşdə dayanıq.* // Möhkəmlik, müqavimət qabiliyyəti. *Mübarizədə dayanıq göstərmək. Soyuğa* (*istiyə*) *dayanıq.*

3. *məc*. Sədaqət, etibar, dəyanət. *Dostun dosta dayanığı. Dayanığı olmayan yoldaş.*

**DAYANIQLAŞDIRILMAQ** *məch*. Dayanıq, sabit bir vəziyyətə gətirilmək; sabitləşdirilmək. *Vışka dartıcı vasitəsilə dayanıqlaşdırılır.* S.Quliyev.

**DAYANIQLAŞDIRMA** "Dayanıqlaşdırmaq"dan *f.is.*

**DAYANIQLAŞDIRMAQ** *f.* Dayanıqlı etmək, möhkəm etmək, bərkitmək, davamlı etmək, dözümlü etmək. *Bədəni soyuğa dayanıqlaşdırmaq.*

**DAYANIQLI** 1. *sif.* Dayanığı olan, möhkəm, səbatlı, mətanətli, dözümlü. *Zəki çox dayanıqlı, səbirli və iradəli bir gənc idi.* A.Şaiq.

2. Sabit, dəyişməyən, dağılmayan, pozulmayan, davamlı, sürəkli.

**DAYANIQLIQ** *is.* Sabitlik, davamlılıq, möhkəmlik. // Səbat, mətanət, dözüm.

**DAYANIQSIZ** *sif.* 1. Dayanığı olmayan, möhkəm olmayan; mətanətsiz, səbatsız, dözümsüz. *Dayanıqsız adam.*

2. Sabit olmayan; davamsız, keçici, sürəksiz. *Melodiyadakı dayanıqsız səslərin təbiətində sabit səslərə doğru daimi hərəkət meyli duyulur.* Ə.Bədəlbəyli.

**DAYANIQSIZLIQ** *is.* 1. Dayanığı, mətanəti, səbatı, dözümü olmama; mətanətsizlik, səbatsızlıq, dözümsüzlük.

2. Davamsızlıq, qeyri-sabitlik, keçicilik, sürəksizlik.

**DAYANIŞ** *is.* Dayanma, durma tərzi.

**DAYANMA[1]** "Dayanmaq[1]"dan *f.is.*

**DAYANMA[2]** "Dayanmaq[2]"dan *f.is.*

**DAYANMADAN** *zərf* Durmadan, ara vermədən, arası kəsilmədən. *Yağış dayanmadan yağır. Dayanmadan qışqırmaq. – Dayanmadan tüfəngimi boşaltdım; Dallarınca bir neçə güllə atdım.* A.Səhhət. *Fərman dayanmadan işlədiyi halda, gözləri ilə kənarda durmuş gəncləri süzürdü.* Ə.Sadıq.

**DAYANMAQ[1]** *f.* 1. Dayaq etmək, dayamaq, söykənmək. *Şeyx Nəsrullah naxoş kimi heç kəsə baxmayıb dayanır yastıqlara.* C.Məmmədquluzadə. *Nənə əlini yumruqlayıb masaya dayandı.* S.Rəhimov. // Dirənmək, lap yanaşmaq. *Bəylərbəyinin faytonu qapıya dayandı.* M.S.Ordubadi.

2. Rast gəlmək, rastlaşmaq. *Dəxi işimiz çox çətin yerə dayandı: bir yandan söz vermişik ki, "Tazə həyat"ın nəsihətinə əməl edək və heç kəsi özümüzdən incitməyək, bir yandan da lazım gəlir, ...oxucularımız ilə bir az söhbət eləyək.* C.Məmmədquluzadə.

**DAYANMAQ[2]** *f.* 1. Hərəkətsiz hala düşmək; hərəkətini, işini saxlamaq. *Kim isə zəncirləri yerə atır. Dəzgah xırp dayanır.* M.İbrahimov. *Qazma borusunun yoxluğu üzündən buruqda işlər dayandı.* M.Hüseyn. // Fəaliyyətdən qalmaq, daha fəaliyyət göstərməmək, fəaliyyətini kəsmək. *Və onlara bildirildi ki, "Şərqi-Rus" qəzeti müvəqqəti olaraq dayanıbdır.* C.Məmmədquluzadə. // Kəsilmək, qurtarmaq, ara vermək. *Külək yatır, qar dayanır, açılır səhər.* S.Vurğun.

2. Bir yerdə qərar tapmaq, gəlib bir yerdə durmaq, daha irəli hərəkət etməmək. *Maşın bir dövrə vurub dayandı.* Mir Cəlal.

3. Ayaq üstə durmaq. *Qapılar örtülüb qapanmışdır; Arxasında nökər dayanmışdır.* A.Səhhət. *Bəzən ayna qabağında dayanıb gəlin; Öz hüsnünə dönə-dönə baxır vüqarla.* S.Vurğun. // Durmaq, çəkmək. *Növbədə dayanmaq.*

4. Dözmək, tab gətirmək, davam gətirmək, qatlaşmaq. *Sabitqədəm olsaydı əgər yari-vəfadar; Aşiq dəxi qaçmazdı bəladan, dayanardı.* M.Ə.Sabir. *Könlümün şüşəsi, saqın ki, sınar; Toxunursa ayna daşa dayanmaz.* Aşıq Ələsgər. [Hacı:] *Hər gunə əziyyətə dayandıq.* C.Cabbarlı.

5. Səbat göstərmək, üstündə durmaq, israr etmək. *Sözünün üstündə dayanmaq.*

6. Bir şey haqqında müfəssəl danışmaq. *..Mən də bu sözün üstə çox dayanıb uzun-uzadı danışmaq istəmirəm.* C.Məmmədquluzadə.

7. Səbir etmək, gözləmək, toxtamaq, duruş gətirmək. *Bir qədər dayanmaq lazımdır. – Dedi: – Qışdır hənuz, həmsayə; Meynə fəsli deyil, dayan yayə.* M.Ə.Sabir. *Cahangir cavab vermədi, o qəsdən bir az da qaşqabağını sallayaraq dayandı.* S.Rəhman. ☐ **Dayanıb durmaq** – sakit durmaq, toxtamaq, heç bir təşəbbüs, hərəkət göstərməmək, iş görməmək, heç nə etməmək. **Daya-**

**nıb duran yerdə** – heç bir səbəb olmadan, nahaqdan.

8. Qalxmaq, yüksəlmək (adətən "ərşə", "göyə" sözləri ilə). *Fərraşların küçələrdə .. səsi hər dəqiqədə ərşə dayandı.* M.F.Axundzadə. *Əkdiklərimin tamamı yandı; Fəryadlarım göyə dayandı..* M.Ə.Sabir. *Bir matəm paltarı geymiş üfüqlər; Tüstülər ah çəkib göyə dayanır..* S.Vurğun.

**DAYANMAZ** *sif.* Dayanmayan, durmayan, arası kəsilməyən, ara verməyən.

**DAYANMAZLIQ** *is.* Dayanmayan, arası kəsilməyən şeyin halı.

**DAYAZ** 1. *sif.* Dərinliyi az olan, çox da dərin olmayan (*dərin* ziddi). *Nurəddin dayaz yer axtararkən gəlib bir yerə çatdı ki, orada bir uzun ağac sınıb körpü kimi çayın üstünə düşmüşdü.* S.S.Axundov. // Üzdə olan, çox dərində olmayan. *Belə dayazdan* (z.) *çıxan suya kənd arasında "qara su" deyirlər.* Ə.Haqverdiyev.

2. *is.* Çay, dəniz, göl və s.-də suyun dərin olmayan yeri.

3. *sif. məc.* Dərin olmayan, səthi, qeyri-ciddi, işin mahiyyətinə, dərinliyinə varmayan. *Dayaz adam. Dayaz fikir. Dayaz düşüncə. – Əqli dayaz, dağ çapan oğlana bax; Durdu yerindən ki, nə heyha imiş.* Ə.Nəbati. *Onların hər ikisi anlaşa bilməyən, dayaz bir həqiqəti öyrənmək qabiliyyətinə malik olmayan adamlar idi.* M.S.Ordubadi.

**DAYAZCA** *sif.* Az dayaz, dayazlığı az olan. *Dayazca çay. Çayda dayazca bir yer tapıb keçdik.*

**DAYAZFİKİRLİ** *sif.* Dayaz düşünən, səthi düşünən, işin əsil mahiyyətini, dərinliyini düşünə bilməyən; dardüşüncəli. *Dayazfikirli adam.*

**DAYAZFİKİRLİLİK** *is.* Dayazfikirli adamın hal və keyfiyyəti; dardüşüncəlilik.

**DAYAZLAMA** "Dayazlamaq"dan *f.is.*

**DAYAZLAMAQ** *f.* Dayaz şəklə düşmək. *Torpaq töküb çuxuru dayazladı.*

**DAYAZLANDIRILMA** "Dayazlandırılmaq"dan *f.is.*

**DAYAZLANDIRILMAQ** *məch.* Dayaz hala salınmaq.

**DAYAZLANDIRMA** "Dayazlandırmaq"-dan *f.is.*

**DAYAZLANDIRMAQ** *f.* Dayaz hala salmaq; dayazlaşdırmaq. *Quyunu qumla dayazlandırmaq.*

**DAYAZLANMA** "Dayazlanmaq"dan *f.is.*

**DAYAZLANMAQ** *f.* Dərinliyi azalmaq, dayaz olmaq.

**DAYAZLANMIŞ** *f.sif.* Dayaz hala gətirilmiş, dərinliyi azaldılmış; dayazlaşdırılmış.

**DAYAZLAŞDIRMAQ** "Dayazlaşmaq"-dan *icb.*

**DAYAZLAŞMA** "Dayazlaşmaq"dan *f.is.*

**DAYAZLAŞMAQ** *f.* Dayaz hala düşmək; getdikcə dayaz olmaq, dərinliyi azalmaq.

**DAYAZLAŞMIŞ** *f.sif.* Dayaz hala gəlmiş, dərinliyi azalmış.

**DAYAZLATMA** "Dayazlatmaq"dan *f.is.*

**DAYAZLATMAQ** *icb.* Dayaz hala saldırmaq; dayazlaşdırmaq.

**DAYAZLIQ** *is.* 1. Çayda, göldə, dənizdə dayaz yer, dərinliyi az olan yer. *Dayazlıqda üzən qazlar. Sahildə əmələ gələn dayazlıqlar. – Xəzər dənizi dayazlıqlarının qurudulması neft sənayesinin inkişafı üçün böyük əhəmiyyətə malikdir.* (Qəzetlərdən). // Dayaz çayın, gölün və s.-nin halı. *Çayın dayazlığı.*

2. *məc.* Səthilik, qeyri-ciddilik. *Meşşan qadınların mənəvi boşluğunu, dayazlığını hər iki aktrisa real cizgilərlə əks etdirməyi bacarır.* M.Arif.

**DAYÇA** *is.* Biryaşar erkək at balası. *Qaşqa dayça. – Heç kəsin ağlına gəlməzdi ki, bu arıq və kifir dayça böyüyüb gözəl bir at olacaq.* M.Hüseyn.

**DAYÇALI** *sif.* Yanında balası olan. *Dayçalı at.*

**DAYDAY** *is.* Uşaq dilində: dayı. [Səttar:] *.. sabah anan məni Kürdəxanıya daydaygilə aparacaq...* Ə.Məmmədxanlı.

**DAYƏ** *is.* [*fars.*] 1. Uşağa baxan, uşağa qulluq edən qadın; mürəbbiyə. *O zaman dayə, Əli ilə bərabər gəzməyə getmək istəyirdi.* İ.Musabəyov. [Ağca] *dünyagörmüş xanımların məsləhəti ilə bir dayə tutub, uşağı ona tapşırdı.* Mir Cəlal. // Özgə uşaqlarına öz südünü verib bəsləyən qadın. // *məc.* Ümumiyyətlə, tərbiyəçi, tərbiyə edib yetişdirən. *Dayəm idi bu dərə, dağlar mənim; Oynağım olmuş idi bağlar mənim.* A.Şaiq.

2. Öz balasından əlavə başqa bir balaya da süd verən doğmuş heyvan. *Qoyunların südü az olduqda və ya onların yelini xəstə olduqda və dayələr* (*"analar"*) *olmadıqda, quzulara inək, yaxud qoyun südü içirtmək lazım gəlir.* "Ümumi zootexniya".

3. Xəstəxanalarda xəstələrə qulluq edən qadın. // *məc*. Baxıcı, xidmətçi. *..Dayənin xoş sözü, nəvazişi də; Körpə ürəkləri isidə bilməz.* B.Vahabzadə.

**DAYƏLİK** *is*. Dayənin işi, vəzifəsi. Dayəlik etmək.

**DAYI** *is.* 1. Ananın qardaşı.

2. Qoca və ya yaşlı kişiyə müraciət edərkən, ya haqqında danışarkən hörmət əlaməti olaraq deyilir. [Əsəd bəy:] *Hayıf, hayıf, Dursun dayı, qocaldın.* C.Cabbarlı. *Məni qəmgin görsə əgər; Düşmən gülər, dost qəm yeyər; Qızlar baxıb "dayı" deyər; Ağarma, saçım, ağarma!* M.Araz. // Bəzən kinayə və ya istehza ilə deyilir. *Boşla, ay molla dayı, sən də bizi çəkmə zora; Biz sənin hiylən ilə düşmərik əsla bu tora.* M.Ə.Sabir.

3. *məc*. *dan*. Öz hüququndan sui-istifadə edərək birisinə qeyri-qanuni kömək edən, himayəsi altına alan adam haqqında (adətən mənfi mənada). *Onun burada dayısı var.*

**DAYIARVADI** *is*. Ananın qardaşı arvadı.

**DAYIDOSTU** *is*. Hörmət və nəzakət əlaməti olaraq dayıarvadına verilən ad və müraciət. [Ana:] *..Dur, onlara gedək, oğul, dayıdostun böyük tədarük görüb.* S.Rəhman.

**DAYIGƏLİNİ** *is.* Dayıoğlunun arvadı, dayının gəlini.

**DAYIQIZI** *is.* Ananın qardaşı qızı. [Səfi bəy:] *Sağ ol, dayıqızı!* S.S.Axundov.

**DAYIQIZILIQ** *is*. Ögey dayıqızı, dayının ögey qızı.

**DAYILI** *sif.* 1. Dayısı olan.

2. *məc*. *dan*. Havadarı, himayəçisi, tərəfdarı olan (adətən mənfi mənada).

**DAYILIQ** *is.* Ögey dayı.

**DAYINƏVƏSİ** *is*. Dayıoğlunun, ya dayıqızının övladı, dayının nəvəsi.

**DAYIOĞLU** *is*. Ananın qardaşı oğlu.

**DAYIOĞLULUQ** *is*. Ögey dayıoğlu, dayının ögey oğlu.

**DAYIUŞAĞI** *is.* Dayının oğlu, ya qızı.

**DAYLAQ** *is.* At balası (altı aylıqdan iki yaşa qədər).

**DAYLAQLI** *sif.* Yanında balası (daylağı) olan. *Daylaqlı madyan.*

**DAYNA** *əd. məh*. Təkid bildirir; da, də. [Şahqulu:] *Ay Səfiqulu dayı, doğru deyir, dayna!* N.Vəzirov. *Alo kişi də gedə-gedə ah çəkib: – Düzəldə də bilmədik, dayna, – deyib söhbətini davam etdirdi.* S.Rəhimov.

**DAZ** *sif.* 1. Xəstəlik, qocalıq və b. səbəblərdən başının tükü tökülmüş, başı tüksüz. *Balacayev özü ucaboylu, sarı, qırmızıbığlı, başı daz, peysəri dolu, ortayaşlı bir adam idi.* S.Rəhimov. [Kişinin] *daz başı qalaylanmış qab kimi işıldadı.* Mir Cəlal. // *is.* Başda tük çıxmayan yer. *Başının dazı.*

2. Otsuz, bitkisiz, çılpaq. *Daz çöl.* – *Görünür onların altında böyük daz qayalar; Onun altında zəifcik qurumuş otlar var.* A.Səhhət. // Yarpaqsız. *Daz ağaclar*.

**DAZBAŞ** *sif.* Başı daz olan, başında tükü olmayan. *Dazbaş kişi.* – *Dazbaş Murtuzov ... eyvana çıxdı..* S.Rəhimov.

**DAZI** *is. bot.* Ot və kol bitkiləri daxil olan bitki cinsi; boyotu.

**DAZLANMA** "Dazlanmaq"dan *f.is.*

**DAZLANMAQ** b a x **dazlaşmaq**.

**DAZLAŞDIRMA** "Dazlaşdırmaq"dan *f.is.*

**DAZLAŞDIRMAQ** *f.* Daz hala salmaq, başının tüklərini tökmək.

**DAZLAŞMA** "Dazlaşmaq"dan *f.is.*

**DAZLAŞMAQ** *f.* 1. Daz hala düşmək, başının tükləri tökülmək. *Başı dazlaşmaq.*

2. Otsuz, bitkisiz hala gəlmək. *Çöl dazlaşmışdır.* // Yarpaqlar tökülmək. *Ağaclar dazlaşmışdır.*

**DAZLAŞMIŞ** *f.sif.* Başının tükü tökülmüş. *Məşədibəy başının ortası tamam dazlaşmış yoğun bir kişini qapı ağzında görüb soruşdu..* M.Hüseyn.

**DAZLIQ** *is.* 1. Daz olmuş başın halı; tüksüzlük. *Başın dazlığı.*

2. Bitkisizlik, çılpaqlıq.

**DE¹** "D" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**DE²** *dan*. b a x **di**.

**DÉBET** [*lat.*] Mühasibat dəftərlərində: bir idarə və ya müəssisənin gəlirini, eləcə də xərc və borclarını göstərən hesab.

**DEBİ́T** *is.* [*fr.*] *xüs*. Bir zaman vahidi ərzində su, neft, qaz və s. mənbəyinin verdiyi suyun, neftin, qazın və s.-nin miqdarı. *Neft quyusunun debiti. Artezian quyusunun debiti.*

**DEBİTLİ** *sif. xüs*. Müəyyən debitə malik olan. *Az debitli köhnə quyular*.

**DEBİTOR** *is.* [*lat.*] *müh*. Borclu (müəssisə, idarə və s.). *Debitorların siyahısı.*

**DEBǘT** is. [*fr.*] 1. Artistin və ya idmançının ilk çıxışı.

2. Şahmatda oyunun başlanğıc hissəsi. *Şahmat oyununun birinci mərhələsi debüt adlanır.*

**DEBÜTÁNT** *is.* [*fr.*] İlk dəfə çıxış edən aktyor və ya idmançı.

**DEDİKCƏ** *sif.* və *zərf* Olduqca, xeyli çox, son dərəcə (çox zaman sifətin dərəcəsini gücləndirir). *Dedikcə gözəl mənzərə. Dedikcə yaxşıdır. Dedikcə ağıllı adamdır. Dedikcə maraqlı kitabdır. – Bir də qapı açıldı və içəriyə ortaboylu, sarışın, dedikcə zərif bir xanım girdi.* Çəmənzəminli.

**DEDİ-QODU** *is.* Bir şəxs və ya şey haqqında adamlar arasında gedən söz-söhbət, danışıq, şayiə. *Bununla da Qızıl Arslan ixtilafın həll olunduğunu və dedi-qoduların bitdiyini zənn edərək sevinirdi.* M.S.Ordubadi. *Bu hadisə bütün məhəllədə dedi-qoduya səbəb oldu.* M.Hüseyn.

**DEDİ-QODUÇU** *sif.* Dedi-qodu ilə məşğul olan; sözgəzdirən. *Dedi-qoduçu adam.*

**DEDİ-QODUÇULUQ** *is.* Dedi-qoduçu adamın xasiyyəti, peşəsi.

**DEDİRTMƏ** "Dedirtmək"dən *f.is.*

**DEDİRTMƏK** *icb.* Deməyə məcbur etmək. *Aclıq nəyi yedirtməz, toxluq nəyi dedirtməz.* (Ata. sözü). *..Məhəbbət coşdu, məni bürüdü: – Ruqiyyə, Ruqiyyə! – dedirtdi.* A.Divanbəyoğlu. *Salman istədiyini Lal Hüseynə dedirtdikdə yumşalıb yerində oturdu.* M.İbrahimov.

**DEDUKSİYA** [*lat.*] *mənt.* Mühakimə prosesində ümumi müddəalardan xüsusi nəticəyə gəlmə; hər hansı bir ümumi fikirdən məntiqi yolla yeni müddəa çıxarma (*induksiya* əksi). *Deduksiya üsulu.*

**DEDUKTİ́V** *sif.* [*lat.*] *mənt*. Deduksiyaya əsaslanan. *Deduktiv üsul. Deduktiv metod.*

**DE-FÁKTO** [*lat.*] Faktik olaraq, felən.

**DEFİ́S** *is.* [*lat.*] İki söz arasında və söz hecalarını sətirdən sətrə keçirdikdə qoyulan kiçik xətt (-); məs.: artıq-əskik, bağ-bağat, bilə-bilə.

**DEFİSİ́T** [*lat.*] *iqt*. Çıxarın gəlirdən çox olması. *Büdcə defisitinin artması.*

**DEFİSİTLİ** *sif.* Defisiti olan, çıxarı gəlirindən çox olan, ziyan verən, ziyanlı. *Defisitli müəssisə.*

**DEFİSİTLİK** *is*. Defisitli olma, çıxarın gəlirdən çox olması. *Büdcənin defisitliyi.*

**DEFİSİTSİZ** *sif.* Defisiti olmayan, defisit verməyən. *Defisitsiz büdcə.*

**DEFORMÁSİYA** [*lat.*] Bir şeyin şəklinin və ya həcminin dəyişməsi; pozulma.

**DEGENERÁSİYA** [*lat.*] *biol*. 1. Təbii şəraitin yaxşı olmaması üzündən bitki və heyvan orqanizminin nəsildən-nəslə cırlaşması, pisləşməsi. *Yemləmə, saxlama və qulluq şəraitinin kifayət dərəcədə olmaması nəticəsində cırlaşmaya degenerasiya, yaxud pisləşmə deyilir.* "Ümumi zootexniya".

2. Canlı orqanizmlərin hüceyrə və ya üzvlərinin pozulması prosesi.

**DEGENERÁT** [*lat.*] Cismani və ya ruhi pozğunluq əlamətləri olan adam.

**DEGENERATİ́V** *sif.* [*lat.*] *biol*. Degenerasiya əlamətləri olan. *"A" vitaminozlu dişilərdə .. sonralar isə degenerativ dəyişmələr baş verir.* "Ümumi zootexniya".

**DEHADE** *is. dan*. Arası kəsilmədən demə, yerbəyerdən demə, söyləmə, danışma.

**DEHQAN** *is.* [*fars.*] *köhn.* Kəndli, əkinçi, rəncbər. *Şəxsi-məzkur Qəzvinin qəryələrindən Kərbəlayı Səlim adlı bir dehqanın oğlu idi*. M.F.Axundzadə. *Böylə həyat içrə yüzdən çox yaşar; Zəhmətkeş dehqanı bizim dağların.* S.Vurğun.

**DEHQANLIQ** *is. köhn*. Kəndlilik, əkinçilik, rəncbərlik.

**DEİ́ST** [*lat.*] Deizm tərəfdarı.

**DEİ́ZM** [*fr.* deisme əsli *lat.* deus – Allah] *fəls.* Allahın yalnız dünyanı yaradan ilk qüvvə olduğunu mümkün hesab edən, lakin onun bir şəxsiyyət kimi mövcud olub təbiət və cəmiyyət həyatına müdaxiləsini inkar edən, XVII-XVIII əsrlərdə Avropada yayılmış dini-fəlsəfi cərəyan.

**DEKÁBR** [*lat.*] Təqvim ilinin 12-ci və sonuncu ayı. *Dekabr soyuqları.*

**DEKABRÍST** [*rus.*] *tar.* 1825-ci ildə dekabrın 14-də Rusiyada təhkimçilik üsulu və mütləqiyyətə qarşı bir qrup zadəgan tərəfindən qaldırılmış inqilabi üsyanın iştirakçısı. *Dekabristlər üsyanı.* – [Peterburq ali məktəb tələbələrinin] *o zaman tələbələrin ən çox sevdiyi və pərəstiş etdiyi adamlar dekabristlər idi.* İ.Şıxlı.

**DEKÁDA** [*fr.* əsli *yun.*] On günlük zaman ölçüsü; ayın üçdə biri; ongünlük. *İncəsənət və ədəbiyyat dekadası. Ayın birinci dekadası.*

**DEKADÉNT** [*fr.*] Dekadentizm tərəfdarı. *Dekadent şairlər.*

**DEKADENTLİK** *is.* [*fr.*] *ədəb. incəs.* XIX əsrin axırı və XX əsrin əvvəllərində burjua ədəbiyyatı və incəsənətində pul düşkünlüyü və ifrat fərdiyyətçiliyi ifadə və "sənət sənət üçündür" şüarını təbliğ edən cərəyan.

**DEKÁN** *is.* [*lat.*] Ali məktəbdə fakültəyə başçılıq edən şəxs. *Universitetin filoloji fakültəsi dekanı.*

**DEKANÁT** [*lat.*] Ali məktəbdə dekanın başçılıq etdiyi fakültənin tədris-inzibati idarəsi; dekanlıq. *Dekanatın sərəncamı. Dekanata müraciət etmək.*

**DEKANLIQ** *is.* 1. B a x **dekanat**.

2. Dekan vəzifəsi.

**DEKLAMÁSİYA** [*lat.*] Şeir və nəsri həyəcanlı səs və hərəkətlə söyləmə; bədii oxu məharəti. *Axşam məktəbdə deklamasiya deyəcəyəm.* Mir Cəlal. *Belə deklamasiya deməyə xüsusən Qələndər meyl göstərirdi.* Ə.Əbülhəsən.

**DEKLAMÁTOR** [*lat.*] Bədii əsərləri məharətlə oxuyan adam; deklamasiya ilə çıxış edən artist.

**DEKLAMATORLUQ** *is.* Məharətlə deklamasiya demə. *Deklamatorluq məharəti. Onun deklamatorluğuna söz yoxdur.*

**DEKLARÁSİYA** *is.* [*lat.*] 1. Hökumət və ya partiyanın bildirişi, bəyanatı.

2. Gömrük bəyannaməsi.

3. Poçt sənədi.

4. Vergi bəyannaməsi.

**DEKOLTÉ** *is.* [*fr.*] Qadın paltarında boğazı, çiyinləri, döşün və kürəyin yuxarı hissəsini açıq göstərən kəsik və bu şəkildə olan qadın paltarı. *Bu dekoltedir. Amerikalılar indi belə paltarı sevir*(*lər*). M.S.Ordubadi. *Nəhayət, Yekaterina İvanovna dekolte bal paltarında içəri girdi.* Çexovdan.

**DEKÓR** b a x **dekorasiya**. *Rəssam yaratdığı dekorlar vasitəsilə keçmiş dövrün həyat və məişəti üçün səciyyəvi olan xüsusiyyətləri məharətlə açıb göstərə bilmişdir..*

**DEKORÁSİYA** [*fr.*] 1. Əhvalatın vaqe olduğu yerin və şəraitin teatr səhnəsində rəssamlıq, yaxud memarlıq cəhətdən təsviri: səhnə tərtibatı. [Şaqqulu:] *Dekorasiyaları da söküb hərəsini bir divara söykədi.* C.Cabbarlı. *Əlvəndi gözlərini dekorasiyadakı balaca deşikdən ayır-mayaraq cavab verdi..* S.Rəhman.

2. *məc.* Zahiri bəzək, bəzək-düzək.

**DEKORASİYAÇI** *is.* 1. Dekorasiya rəssamı.

2. Bəzəkçi, bəzək mütəxəssisi.

**DEKORATÍV** *sif.* [*fr.*] Bəzək üçün düzəldilmiş, bəzək üçün olan. Binalarda dekorativ sütunlar. ◻ **Dekorativ bitkilər** – meyvə və kölgəlik üçün deyil, yalnız bəzək üçün əkilən ağac, kol və s. *Qarşıda, şüşəbənd arxasında müxtəlif dekorativ bitkilər görünür.* Ə.Məmmədxanlı.

**DEKORÁTOR** [*fr.*] 1. B a x **dekorasiyaçı**.

2. Bəzək mütəxəssisi.

**DEKORÇU** b a x **dekorasiyaçı**.

**DEKRÉT** [*lat.*] Ali hökumət orqanının qanun qüvvəsində olan qərarı; fərman, qanun. *Neft sənayesinin milliləşdirilməsi haqqında iyulun 2-də verilən dekret Bakıda mühüm bir hadisə kimi qarşılandı.* M.S.Ordubadi.

**DEQAZÁSİYA** [*xar.*] *xüs.* Qazdan təmizləmə, zərərsizləşdirmə, zərərsiz hala salma.

**DEQAZÁTOR** [*xar.*] 1. Zəhərli maddələrlə zəhərlənmiş yeri, paltarı, şeyləri və s.-ni zərərsiz hala salmaq üçün cihaz.

2. Qazı zərərsizləşdirmək üçün kimyəvi maddə.

3. Zəhərlənmiş şeyin və ya yeri zərərsizləşdirmə işi ilə məşğul olan adam.

**DEQUSTÁSİYA** *is.* [*fr.*] *xüs.* İstehsal edildiyi zaman məhsulun (şərabın, çayın və s.-nin) keyfiyyətinin dadma yolu ilə müəyyən edilməsi. *Üzüm şərablarının dequstasiyası.*

**DEQUSTÁTOR** *is.* [*fr.*] *xüs*. Dequstasiya mütəxəssisi.

**DELEQÁT** [*lat.*] b a x **nümayəndə**. [İkinci qadın:] *..Cahan xala, biz bir çox qadınların tərəfindən buraya deleqat gəlmişik.* Ə.Haqverdiyev. *İndi mən yarımçadralı, ağzıdualı köhnə bir qadını yox, hörmətli bir deleqatı gözləyirdim.* Mir Cəlal.

**DELFÍN** *is.* [*yun.*] *zool.* Dişli balinalar qrupuna mənsub dəniz məməlisi. *Delfinlər dişli və yırtıcı heyvanlardır. – Bir anlıq dünyada yox olsa bəşər; Məni delfinlərin yanına göndər.* M.Araz.

**DÉLTA**[1] [*yun.*] Yunan əlifbasının üçbucaq şəklində olan dördüncü hərfinin (“delta” işarəsi) adı.

**DÉLTA**[2] [*yun.*] *coğr*. Çayların mənsəb hissəsində (dənizə töküldüyü yerdə) əmələ gətirdiyi qollar və onların arasında çöküntüdən ibarət sahə, çay töküntülərindən əmələ gələn düzənlik. *Kür çayının deltası.*

**DEMAQÓGİYA** *is.* [*yun.*] Öz məqsədinə çatmaq üçün hər cür yalan vədlər, yaxud böhtan və s. ilə adamların instinktinə qəsdən təsir etmə, kütlənin geridə qalmış hissəsinin zövqlərinə, əhvali-ruhiyyəsinə riyakarcasına uyğunlaşma. // *dan*. Demaqoqcasına çıxış, danışıq, böhtan.

**DEMAQÓQ** [*yun.*] Demaqoqluq üsulundan istifadə edən. demaqoqluq edən. *Əşrəf kimi cahil sərvətdar övladı olan bu demaqoqlar hər bir məziyyət və qiyməti yalnız sərvət və dövlətdə görür.* A.Şaiq. [Mindilli:] *Sizsiz bu demaqoqların içində mənim ruhum lap çürüyər.* S.Rəhman. // Canlı dildə çox vaxt yerli-yersiz danışan, xəbərçi; adamsatan mənalarında işlənir.

**DEMAQOQCASINA** *zərf* Demaqoqa xas olan bir tərzdə, demaqogiya üsulundan istifadə edərək. *Demaqoqcasına çıxış etmək.*

**DEMAQOQLAŞMAQ** *f.* Demaqoq olmaq, demaqoq kimi danışmaq.

**DEMAQOQLUQ** b a x **demaqogiya**. *Demaqoqluq etmək.* – [Qulu:] *Demaqoqluqla iş olmaz.* İ.Əfəndiyev.

**DEMARKÁSİYA** [*fr.*]: **demarkasiya xətti** – mütarikə və ya sülh bağlayan iki ordunu bir-birindən ayıran xətt, zona; başqa-başqa dövlətlərə məxsus ərazi.

**DEMÁRŞ** [*fr.*] *dipl.* Müqabil tərəfin güzəştə getməsinə nail olmaq üçün edilən təşəbbüs, çıxış, hərəkət, tədbir. *Səfirin demarşı.*

**DEMBLOK** *is.* Demokratiya və blok sözlərinin birləşməsindən əmələ gələn ixtisar söz; abreviatura.

**DEMƏ**[1] “Demək”dən *f.is.*

**DEMƏ**[2] *əd.* Olmuş bir işin, hadisənin danışana sonradan məlum olduğunu bildirir. *Demə, fərraşların kahıllarından yolda dustaqların biri əkilibmiş.* “M.N.lətif.” *Demə, sahibəzzaman tək deyilmiş, Nəsib bəy kimi tayı varmış.* Mir Cəlal. // *köhn*. Bəzən “ki” (kim) bağlayıcısı ilə birlikdə. *Demə kim, bir əmiri-şahsüvar; Eyləyibmiş o gündə əzmi-şikar.* S.Ə.Şirvani.

**DEMƏK**[1] *f.* 1. Bir fikri şifahi surətdə ifadə etmək, bəyan etmək, söyləmək, bildirmək. *Söz demək. Düzünü demək.* – [Aslan bəy:] *..O, bir söz dedimi, heç bir zaman unutmaz.* C.Cabbarlı. // Bir fikri yazılı surətdə ifadə etmək, yazmaq. *Müəllif öz əsərində deyir ki..*

2. Nəql etmək, rəvayət etmək (adətən “ki” bağlayıcısı ilə). *Belə deyirlər ki... – doğrudan deyirmişlər ki, Nikolayın bizə çox əziyyətləri olub..* C.Məmmədquluzadə. // Söhbət etmək, söz açmaq, danışmaq. *Sadıq kişi öz hünərindən söhbət düşmüş kimi, arılardan həvəslə deməyə başladı.* Mir Cəlal.

3. Xəbər vermək, söyləmək, bildirmək. *Bu sözü heç kəsə demə. Bunu sənə kim dedi? Sirri başqalarına demək. – Quş uçar çəmən üstə; Sünbül, yasəmən üstə; Yarım gəldi desələr; Yeri var sinəm üstə.* (Bayatı). // Yetirmək, bildirmək, çatdırmaq. *Mənim fikrimi ona de.*

4. Əmr etmək, sərəncam etmək, tapşırmaq. *Ona de ki, tez gəlsin.*

5. *dan*. Nəzmə çəkmək. Şeir demək. – [Molla:] *Arvad, iki misra demişəm.* “M.N.lətif.”.

6. *dan*. Avazla oxumaq. *Bir-iki kəlmə demək. De gəlsin. Bir ağız demək.*

7. Adlandırmaq, ad vermək. *Buna nə deyərlər? Siz buna nə deyirsiniz? Belə hərəkətə nə demək olar?*

8. Məna vermək, mənasına gəlmək. *Bu söz nə deməkdir? Ərəbcə “həyat” dirilik*

*deməkdir.* // Dəlalət etmək, sübut etmək, ifadə etmək, göstərmək. *Bu, o demək deyil ki...*

9. “Dərs” sözü ilə – müəllimlik etmək, dərs vermək, öyrətmək. *Firidun darülfünundan çıxıb Şəmsiyyəyə dərs deməyə getdi.* M.İbrahimov. *Qəhrəman müəllimlər ittifaqında çalışmaqla müəllimlik sənətini buraxmır, şəhər məktəbində dərs deyirdi.* S.Rəhimov.

10. “Deyəcək” şəklində – deyilməsi, bildirilməsi, xəbər verilməsi vacib olan. *Daha deyəcək sözüm yoxdur.* – [Məmməd:] *Sənə deyəcək iki vəsiyyətim vardır.* “Aşıq Qərib”. [Şahbaz bəy:] *Oğlum, əyləş, sənə deyəcək sözüm çoxdur.* S.S.Axundov.

11. Şəxs sonluqları ilə is. mənasında: **dediyim, dediyin, dediyi** – söylədiyim, söylədiyin, söylədiyi söz, fikir və s. *Dediyinə əməl etmək. Dediyindən belə çıxır ki...* // Bəzən cəm şəklində işlənir. *Usta ... başını bulayıb, dediklərinə yekun vurdu.* M.Hüseyn.

12. “Bir-bir” sözü ilə – sadalamaq, təfərrüatı ilə, ardıcıl surətdə hamısını söyləmək, bildirmək. *Ürəyindəkiləri bir-bir demək.* – *Yetməz əlim, nə çarə, düşən xaki-payüvə; Bir-bir deyəm sənə ələmü möhnətim.* S.Ə.Şirvani.

13. “Deməkdi(r)” şəklində – iki şeyi eyniləşdirmə mənasında işlənir. *Bakıya ali təhsil almağa getmək, Gülşad üçün dözülməz olan nənə və qardaş zülmündən xilas olmaq deməkdir.* Ə.Əbülhəsən.

14. Feli bağlama şəklində: **deyib** – 1) nəzərdə tutaraq, üz tutaraq, istiqamət götürərək. *Qırx lotu bir-birinə qoşulub, Təbriz deyib yola düşdülər*. “Aşıq Qərib”. *Sizi deyib gəlmişəm, ey mənim müsəlman qardaşlarım!* C.Məmmədquluzadə; 2) hesab edərək. *Bu üzü qarə könüldür məni rüsvay eləyən; O ki mən dust deyib tutmuş idim, düşmən imiş.* S.Ə.Şirvani; 3) “durmaq” sözü ilə – daim təkrar etmək, söyləmək. *Xatirinə dəyməsin, Ağa Dərviş, sənin özündə də mən heç bir hərəkət görməmişəm, bəqeyr əz şikayət... – “fələk kəcrəftardır”, – deyib durursan.* N.Vəzirov.

◊ **Deyək ki** – fərz edək ki, tutaq ki. **Deyirdim ki** – bu fikirdə idim ki, belə güman edirdim ki (çox vaxt arzu bildirir). *Deyirdim ki, bir bizə gələsən. – Mən deyirdim ki, bir gün varıb ana yurduna; Öpərsiniz anamın toz basan məzarını...* A.İldırım. **Deyirlər ki** – rəvayət var ki, söhbət var ki, belə danışırlar ki, belə fikir yayılmışdır ki. *Deyirlər ki, bu il qış bərk soyuq olacaq.* **Demək olar ki** – bir şeyin təxminiliyini, möhtəməlliyini, mümkünlüyünü, həqiqətə yaxınlığını bildirən ara söz. *Demək olar ki, indi papaqların fasonu o qədər artıq deyil, nə qədər ki cürbəcür məsləklər moddadır.* C.Məmmədquluzadə. *Demək olar ki, hamı oynayıb yorulandan sonra aşıq məclisə girdi.* Ə.Vəliyev. **Demək olmaz ki** – söylənilən sözün, ya fikrin düzgünlüyünə arxayın olmadıqda, bir şeyi müəyyən etməkdə çətinlik çəkdikdə, yaxud inkarı yumşaltmaq istədikdə işlənən ifadə. *Demək olmaz ki, Hacı Kamyab qardaşını yaxınına buraxmırdı.* Ə.Haqverdiyev. **Necə deyirlər** – fikri tam və düzgün ifadə etməkdə çətinlik çəkdikdə və ya danışanın sözü ilə tam razılığa gəlmədikdə işlədilən ifadə. *Əşrəf, necə deyərlər, canlara dəyən oğlan idi.* İ.Şıxlı. **Nə deyim** – tərəddüd, gözlənilməzlik bildirən ara söz. *Nə deyim, birdən yağış yağar. – İlk qədəmdə öpüşdü, son qədəmdə tüpürcək; Bir qeyri mükafatın olacaqmı, nə deyim?..* M.Araz.

**DEMƏK**[2] *ara söz mənasında.* Söylənmiş fikrə yekun vurmaq, onu xülasə etmək üçün işlənir; deməli, yəni bundan o nəticə çıxır ki. *Siz hazırsınızmı, demək, gedə bilərik. – Demək, bu misranın da əsil mənası bu imiş ki, dünyada keçinmək, güzəran etmək istəyirsənsə, camaat ilə həmrəng ol.* N.Vəzirov. *Demək, belə çıxır ki, Maqsud müəllim Sevili həyat imtahanına çəkirmiş.* S.Rəhimov.

**DEMƏLİ**[1] *sif.* Deyilməsi, bildirilməsi lazım gələn, deyəcək; deyiləsi. [Zaman:] *Zarafat qalsın kənarda, sənə bir neçə deməli sözüm var.* Ə.Haqverdiyev.

**DEMƏLİ**[2] b a x **demək**[2]. *..İki adam əvəzinə bir adam işləyəcək, deməli, iki maaş əvəzinə bir maaş veriləcək.* M.Hüseyn. [Qoşatxan:] *Laqeydlik kənd müəllimi üçün dözülməz bir bəladır, deməli, heç şey onun ürəyini yandırmır.* M.İbrahimov.

**DEMİ** *is. məh.* Qəlyan, çubuq. *Süleyman .. damağında bir uzunquyruq Şəki demisi, kəmali-istirahətlə əyləşib, .. tüstüsünü halqa-*

*halqa havaya buraxmaqda idi.* Ə.Haqverdiyev. ...[Musa kişinin] *demisi daima ağzında tüstülənirdi.* İ.Əfəndiyev.

**DEMİÚRQ** [*yun.*] *fəls*. 1. Platonun idealist fəlsəfəsində Allah.

2. *məc*. Yaradıcı qüvvə, yaradan.

**DEMOKRÁT** [*yun.*] 1. Demokratiya tərəfdarı. *Rus inqilabçı demokratları. Demokrat yazıçılar.*

2. Burjua demokrat partiyasının üzvü.

3. *məc*. Sadəliyi sevən, sadə həyat keçirən, adi adamlara yaxın olan, onlarla ünsiyyət bağlayan adam.

**DEMOKRATÍK** *sif.* [*yun.*] 1. Demokratiyaya müvafiq olan, demokratiya əsasında qurulmuş, demokratiyanı həyata keçirən, demokratiya prinsiplərinə riayət edən. *Demokratik idarə üsulu. Demokratik respublika. Demokratik islahat. Demokratik mətbuat.*

2. Zəhmətkeş xalq kütlələrinə xas olan; sadə, adi. *Demokratik tərbiyə almış adam. – Ədibin demokratik fikirləri onun "Nadir şah" tarixi faciəsində daha parlaq ifadəsini tapmışdır.* M.Arif.

**DEMOKRATİKLƏŞDİRİLMƏ** "Demokratikləşdirilmək"dən *f.is*. *İctimai quruluşun demokratikləşdirilməsi.*

**DEMOKRATİKLƏŞDİRİLMƏK** *məch*. Demokratik hala salınmaq, demokratizmə tabe edilmək, demokratizm həyata keçirilmək.

**DEMOKRATİKLƏŞDİRİLMİŞ** *f.sif.* Demokratik hala salınmış, demokratizm əsasında qurulmuş, demokratizmə tabe edilmiş.

**DEMOKRATİKLƏŞDİRMƏ** "Demokratikləşdirmək"dən *f.is*.

**DEMOKRATİKLƏŞDİRMƏK** *f.* Demokratik hala salmaq, demokratizm tətbiq etmək, demokratiya əsasında qurmaq, demokratiyaya tabe etmək. *Seçki sistemini demokratikləşdirmək.*

**DEMOKRATİKLƏŞMƏ** "Demokratikləşmək"dən *f.is.*

**DEMOKRATİKLƏŞMƏK** *f.* Demokratik hala düşmək, daha demokratik olmaq.

**DEMOKRATİKLİK** *is.* Demokratiya prinsiplərinə əsaslanma. *Seçkilərin demokratikliyi.*

**DEMOKRÁTİYA** *is.* [*yun.*] 1. Dövləti idarə işi xalqın əlində olduğu idarə üsulu, siyasi quruluş; xalq hakimiyyəti. *Xalq demokratiyası ölkələri.*

2. İctimai təşkilatların həyat və fəaliyyətində bütün kollektiv üzvlərinin fəal iştirakını və təsirini təmin edən rəhbərlik üsulu. *Partiya daxili demokratiya.*

**DEMOKRATÍZM** [*yun.*] 1. Demokratiyanı qəbul edib həyata keçirmə. // Demokratlıq. *"Molla Nəsrəddin" inqilabi demokratizmin ifadəçisi və mərkəzi idi.* M.İbrahimov. *Oqtayın demokratizmi bizi inandırır ki, o, doğrudan da qarşısına qoyduğu məqsədə çata biləcəkdir.* M.Arif.

2. *məc*. Həyatda, insanlarla münasibətdə və s.-də sadəlik.

**DEMOKRATLAŞMA** "Demokratlaşmaq"-dan *f.is*.

**DEMOKRATLAŞMAQ** *f.* Daha demokrat olmaq, həyat tərzi və s. cəhətdən daha da sadələşmək.

**DEMOKRATLIQ** *is.* bax **demokratizm** 2-ci mənada.

**DEMOQRÁFİYA** [*yun.* demos – xalq və grapho – yazıram] Statistikanın, əhalinin tərkibini, artımını, miqdarını və hərəkətini öyrənməklə məşğul olan şöbəsi. *Demoqrafiya ictimai elmdir.*

**DÉMPİNQ** [*ing.*] *iqt.* Xarici bazarlarda rəqibləri aradan çıxarmaq məqsədilə malların maya qiymətindən və daxili bazardakından daha ucuz satılması.

**DENATURÁT** [*lat.*] Texnikada işlədilmək üçün hazırlanan zəhərli spirt.

**DENDRARİ** *is.* [*yun.*] Botanika bağının açıq sahələrində plan üzrə əkilmiş ağac və kol bitkiləri.

**DENŞÍK** [*rus.*] Çar ordusunda zabitə xidmət edən sıravi əsgər. [Zurin] *mənim denşikimi çölə çıxardı və mənimlə işi olduğunu söylədi.* Puşkindən. *Bu zabitlərin hər birinin arxasınca kazak paltarı geymiş xüsusi denşiklər vardı.* P.Makulu.

**DEPARTÁMENT** [*fr.*] 1. İnqilabdan əvvəl Rusiyada və bəzi xarici ölkələrdə: nazirliyin, ali hökumət və ya məhkəmə idarələri şöbələrinin adı. *Layihədən 5 nüsxəni ümumi idarə departamentinin direktoru Baranovskiyə xüsusi bir ərizə ilə bərabər təqdim etmişəm.* M.F.Axundzadə. *Bir dəfə* [Xlestakova]

*departamentin direktorluğunu təklif etdilər.* F.Köçərli.

2. Fransada: inzibati-ərazi bölgü vahidi.

3. Amerika Birləşmiş Ştatlarında və İsveçrədə: nazirlik. *Dövlət departamenti* (ABŞ-da xarici işlər nazirliyi).

**DEPÉŞA** [*fr*.] 1. Təcili diplomatik, hərbi və s. məlumat.

2. Teleqram.

**DEPÓ** [*fr*.] 1. Vaqon və lokomotivlərin dayanması və təmiri üçün xüsusi yer, emalatxana. *Dəmiryol deposunda da işi buraxıb tətilə başladılar.* M.S.Ordubadi. [Qəhrəmani] *..depoda parovozların təmir ustası vəzifəsində çalışırdı.* M.İbrahimov.

2. *is. fiziol*. Canlı orqanizmdə qan saxlayan üzvlər (qalaq, qara ciyər, dəri). *Qan deposu.*

**DEPONÉNT** [*lat.*] *mal*. Depozitə pul və ya qiymətli kağız qoyan.

**DEPORTASİYA** *is.* [*lat.*] Bir xalqın yaşadığı ölkə ərazisindən zorla çıxarılması, məcburi köçürülməsi və ya qovulması. *1948-1953-cü illərdə azərbaycanlıların Ermənistan SSR ərazisindəki tarixi-etnik torpaqlarından kütləvi surətdə deportasiyası.*

**DEPOZÍT** [*lat.*] *mal*. Müəyyən məqsədlə saxlanılmaq üçün banka və ya başqa kredit idarəsinə verilən pul və ya qiymətli kağız(lar).

**DEPRÉSSİYA¹** *is.* [*lat.*] Təsərrüfat durğunluğu, bahalıq, ticarət mallarına tələbatın zəifliyi, işsizliklə səciyyələnən vəziyyət.

**DEPRESSİYA²** *is.* [*lat.*] Bütün ətrafın, hər şeyin qaranlıq içində görünməsi ilə səciyyələnən psixi vəziyyət; ruh düşkünlüyü.

**DEPUTÁT** *is.* [*lat.*] 1. Müəyyən edilmiş qayda üzrə qanunverici, yaxud nümayəndəli orqana əhali tərəfindən seçilən şəxs.

2. Nümayəndə. *Gürcüstanın hər yerindən – uzaq və uca dağlarından, dərin dərələrindən və qalın meşələrindən deputatlar Tiflis şəhərinə cəm olub.* F.Köçərli.

**DEPUTATLIQ** *is*. Deputat vəzifəsi. *Deputatlığa namizəd. Deputatlıq nişanı. Deputatlıq səlahiyyəti.*

**DERMATÍN** [*yun*.] Üstü sellülozla örtülmüş parçadan hazırlanan süni dəri növü. // Bu dəridən qayrılmış, üzərinə bu cür dəri çəkilmiş. *Dermatin cild.*

**DERMATOLÓGİYA** [*yun*.] Tibb elminin dəri xəstəliklərindən və onların müalicəsindən bəhs edən şöbəsi.

**DERMATOLOQ** [*yun*.] Dəri xəstəlikləri mütəxəssisi olan həkim.

**DESÁNT** *is.* [*fr*.] 1. Hərbi əməliyyat aparmaq üçün gəmi, təyyarə və b. vasitələrlə düşmən torpağına çıxarılan qüvvə. *Hava desantı. Desant çıxarmaq. – Sahilə çıxan desant almanları limandan qovdu...* M.Hüseyn. *...Gecə desantını iki təyyarə salmalı, iki hissə əlbir hərəkət etməli idi.* Ə.Əbülhəsən.

2. Düşmən torpağına qoşun çıxarma əməliyyatı.

**DESANTÇI** *is*. Desant qoşunları döyüşçüsü.

**DESÉRT** *is.* [*fr*.] Xörəkdən sonra verilən meyvə, şirniyyat və s.

**DÉSPOT** [*yun*.] 1. Dövləti qanun əsasında deyil, öz istədiyi kimi idarə edən zülmkar, müstəbid hökmdar; hakimi-mütləq. *Taxt və tac, yaxşı məqsədlə işə başlayan Nadiri də despota çevirir.* M.Arif.

2. *məc*. Başqalarını öz iradəsinə tabe etməyə çalışan, onların arzu və iradəsini tapdalayan adam.

**DESPOTCASINA** *zərf* Despot kimi, müstəbidcəsinə, zülmkarcasına. *Despotcasına hərəkət etmək.*

**DESPOTÍK** *sif.* [*yun*.] Müstəbid, istibdadçı, zülmkar. *Despotik hökumət. – Rza xanın qəzəbli üzü və gözləri, despotik rəftarı onu çaşdırmışdı.* M.İbrahimov.

**DESPOTÍZM** [*yun*.] 1. İstibdada əsaslanan dövlət quruluşu; qeyri-məhdud hakimiyyət; istibdad, mütləqiyyət.

2. *məc*. Zülmkarlıq, müstəbidlik, zülm. *Məlumdur ki, elm və mədəniyyət geniş yayıldıqdan sonra despotizm, fanatizm .. artıq yaşaya bilməzlər.* M.F.Axundzadə. *O dövr, .. Höte və Şiller kimi ölməz sənətkarların orta əsr həyat tərzinə və zehniyyətə qarşı, zülm və despotizmə qarşı şiddətli mübarizəyə başlayaraq humanizm, azadlıq, bəşəriyyətçilik bayrağını ucaltdığı dövrdür.* M.İbrahimov.

**DESPOTLUQ** b a x **despotizm** 2-ci mənada.

**DESYATÍN** [*rus*.] Metr sistemindən qabaq tətbiq edilən 1,09 hektara bərabər yer ölçüsü. *Desyatinə iki yüz manat deyənin ağzından vururlar.* A.Şaiq.

**DEŞDİRİLMƏ** "Deşdirilmək"dən *f.is.*

**DEŞDİRİLMƏK** *məch*. Başqasına deşdirmək, deşik açdırılmaq.

**DEŞDİRMƏ** "Deşdirmək"dən *f.is.*

**DEŞDİRMƏK** *icb.* Deşik açdırmaq. *Taxtanı deşdirmək. Dəmiri deşdirmək.*

**DEŞİCİ** *sif.* 1. Dələn, deşən, dəlici, deşə bilən. *Deşici alət.*

2. *məc*. Sancıcı, dəlici, iti.

**DEŞİK** *is.* 1. Dəlik, dərin daz çuxur. *Deşiyi bərkitmək. Deşikdən siçan çıxdı. – Qaranlıq bucaqlarda taxça kimi deşiklərə düzülüb saxsı qab-qaşıq, bir-iki mis qab.* C.Məmmədquluzadə. // Boşluq, boş yer. [Tülkü] *öz heyvanlığı ilə heç bir zaman bir deşiyi olan yuvada yaşamaz, onun yuvasında iki deşik olmalıdır.* M.S.Ordubadi. // Cırıq yer, yırtıq yer, deşilmiş yer. *Vedrə deşiyindən damır.*

2. *sif.* Cırıq, yırtıq, deşilmiş, cırılmış. *Deşik kisə. Deşik qazan. Deşik corab.*

3. Bir şeyin (məs.: burnun, qulağın və s.-nin) dairəvi şəkildə olan içi. *Burun deşiyi. Qulaq deşiyi. – Umud yavaşca nəfəs çəkdi və elə bildi ki, toz burnunun deşiklərindən keçib dilçəyində palçığa döndü.* İ.Məlikzadə.

**DEŞİKAÇAN** *is*. Deşik açmaq üçün alət.

**DEŞİK-DEŞİK** *sif.* Çox deşiyi olan. *Deşik-deşik divar. Deşik-deşik kağız.* □ **Deşik-deşik eləmək** – çoxlu deşik açmaq, hər yerini deşmək. *Ol siçana çəngini vurdu pişik; Eylədi əndamını deşik-deşik.* S.Ə.Şirvani. – *Tikan onun* [Salatının] *bədənini deşik-deşik etmişdi.* İ.Şıxlı. **Deşik-deşik olmaq** – çoxlu deşiklər açılmaq, yırtıq-yırtıq olmaq. [Fərhadın] *gözləri sağ qıçına, deşik-deşik olmuş yaşıl mahud şalvarına sataşınca ürəyində qopan ağrı gicgahlarında bənd aldı.* Ə.Vəliyev.

**DEŞİKLİ** *sif.* Deşiyi olan, deşilmiş.

**DEŞİLMƏ** "Deşilmək"dən *f.is.*

**DEŞİLMƏK** 1. "Deşmək"dən *məch*. *...Nişançının atdığı oxlardan kürkün də deşilib, papağın da.* "M.N.lətif."

2. *t-siz.* Üstü açılmaq, irinin və s.-nin çıxması üçün yol açılmaq. *Çiban deşildi.*

**DEŞİLMİŞ** "Deşilmək"dən *f.sif. Deşilmiş divar. Deşilmiş vedrə. Deşilmiş yara. – Güləsər atasının altı deşilmiş çarığını gözdən keçirdi və içəri adladı.* İ.Şıxlı.

**DEŞMƏ** "Deşmək"dən *f.is.*

**DEŞMƏK** *f.* 1. Deşik açmaq, dəlmək. *Burğu ilə taxtanı deşmək. Divarı deşmək. Siçan döşəməni deşib.* – [Eyvaz kişi] *bəndə çatınca su bəndi deşib məğrur bir tərzdə gücü gəldikcə fışqırırdı.* Ə.Vəliyev.

2. İynə və s. ucuiti şey batıraraq dəlik açmaq. *Çibanı deşmək.*

3. *məc*. Dərinlərə işləmək, çox dərin təsir etmək. *Şaxta adamın beynini deşir.*

**DETAL** *is.* [*fr.*] 1. Ən xırda təfərrüat.

2. *tex*. Maşın və mexanizmin irili-xırdalı hissələri. *Ağ hamar detal iti bıçaq altında fırlanır...* H.Seyidbəyli.

**DETALLAŞDIRILMA** "Detallaşdırılmaq"-dan *f.is.*

**DETALLAŞDIRILMAQ** *məch*. Bütün cəhətləri və təfərrüatı nəzərə alınmaq; dəqiqləşdirilmək.

**DETALLAŞDIRMA** "Detallaşdırmaq"dan *f.is*. *..Əsərlərin yazılışında detallaşdırma cəhətinə xüsusi diqqət yetirilir.* Ə.Bədəlbəyli.

**DETALLAŞDIRMAQ** *f.* Bütün cəhətlərini və təfərrüatını nəzərə almaq; dəqiqləşdirmək. *Planı detallaşdırmaq.*

**DETEKTÍV** [*ing*. əsli *lat.*] Casusların macəralarını təsvir edən əsər. *Detektiv roman.*

**DETÉKTOR** *is.* [*lat.*] *rad.* Yüksək tezlikli titrəyişləri qulaqla qavranıla bilən alçaq tezlikli titrəyişlərə çevirən cihaz.

**DETERMİNÍST** [*lat.*] *fəls.* Determinizm tərəfdarı.

**DETERMİNÍZM** [*lat.*] *fəls*. Cəmiyyət və təbiətdə baş verən bütün hadisələrin ümumi obyektiv qanunlardan və səbəbiyyət əlaqəsindən asılı olduğu haqqında elmi anlayış.

**DEVALVÁSİYA** [*fr.*] *iqt.* Qiymətdən düşmüş kağız pulların tədavüldən götürülərək sabit kağız pullarla əvəz edilməsindən ibarət pul islahatı. // Kağız pulların məzənnəsinin aşağı salınması.

**DEVİK** *sif. məh*. İş görəndə o yan-bu yana baxmağa adət etmiş. *Devik adam.*

**DEVİKMƏ** "Devikmək"dən *f.is.*

**DEVİKMƏK** bax **döyükmək**. *Bunların devikdiyini görən Rüstəm dayandı.* S.Rəhimov.

**DEVİRMƏ** "Devirmək"dən *f.is.*

**DEVİRMƏK** *f.* 1. Altını üstünə çevirmək, başıaşağı etmək. *Qazanı devirmək. Stolu devirmək.*

2. *məc.* Yıxmaq, hakimiyyətdən məhrum etmək, ortadan qaldırmaq, ləğv etmək. *Mütləqiyyəti devirmək. Burjuaziyanı devirmək. – İndi artıq yıxıldı, batdı qanlı saraylar; Devirdilər taxtını, qan içən padşahın.* Ə.Cavad.

**DEVÍZ** *is.* [*fr.*] 1. Əsas bir fikrin, məsləkin, əqidənin qısa şəkildə ifadəsi. *Səbirlə fürsət gözləmək ..* [Mollayevin] *devizi idi.* M.Hüseyn.

2. Konkurslarda: müəllifin öz ad və familiyası əvəzində əsəri üzərində yazdığı söz, ya ibarə.

**DEVR** 1. B a x **dövr**[1].

2. B a x **dövrə** 2-ci mənada. *Bu ümid ilə ki qəmzəndən ala kami-dilin; Düzülüb gözlərini dövrünə müjgan səf-səf.* S.Ə.Şirvani.

3. *etnoqr.* Evə gətirilmiş gəlinə xalça üzərində yer açmaq adəti. *Həsən ağanın bağçıları gəlinin yerini xalça üzərində açmağa başladılar. Buna devr deyirdilər.* M.S.Ordubadi.

**DEVRİLİŞ** *is.* Devirmə işi, devrilmə, çevriliş.

**DEVRİLMƏ** "Devrilmək"dən *f.is.*

**DEVRİLMƏK** *məch.* 1. Altı üstünə çevrilmək, başıaşağı edilmək.

2. *məc.* Hakimiyyətdən məhrum edilmək, məhv edilmək, ortadan qaldırılmaq. *Çar üsuli-idarəsi 1917-ci il fevral ayının 27-də devrildi. – Şahlıq devrilsə də, başqa rəng alıb; Yaşayır əvvəlki zülm başqa cür.* B.Vahabzadə.

**DEYƏ** *qoş.* Səbəb və ya məqsəd bildirir. *Gecikməsin deyə tezdən durdu. – Əmirxanı oyatmayır, dincəlsin deyə; Bəzən onun nəfəsinə qulaq da asır.* S.Vurğun. *Rahat yatsın deyə körpəm beşikdə; Dayanmışdır keşikdə igid, qəhrəman Bakı.* R.Rza.

**DEYƏ-GÜLƏ** *zərf* Gülə-gülə, şən bir halda söhbət edə-edə. *Əmirxan quş kimi qalxdı ayağa; Dostlar deyə-gülə getdilər bağa.* S.Vurğun. *Eyvazın manqasındakı oğlan və qızlar deyə-gülə işləyirdilər.* Ə.Vəliyev.

**DEYƏK (Kİ)** *ara söz.* Tutaq ki, fərz edək ki, elə bil. *Deyək ki, bu gün xəstələndin.* [Şamxal] *Yaxşı, deyək ki, atam kişidi, gözü qızışıb, bəs bu nə üçün evini-eşiyini buraxıb arvad üstünə gəlib?!* İ.Şıxlı.

**DEYƏN** *dan.* b a x **deyəsən**. *Deyən, o getdi. – Deyən, əkizlərlə gəldi bərabər; Poladın evinə ögey-doğmalıq.* M.Rahim.

**DEYƏN-GÜLƏN** *sif.* Şən, ürəyiaçıq, zarafatcıl, əhvallı. *Deyən-gülən, söhbətcil oğlan.*

**DEYƏSƏN** *ara söz mənasında.* Ehtimal, gərək ki, görünür (ki). *Onun dedikləri, deyəsən, düz çıxmadı. Deyəsən, gələn var.* – [Fazil:] *Vallah, mən özüm də məəttəl qalmışam; çünki o dəli övrətdən də, deyəsən, bir haray yoxdur.* C.Məmmədquluzadə. [Sənəm:] *Ax, deyəsən, ağa gəlir. Ay aman, ağa gəlir; dur qaç!* Ü.Hacıbəyov. *Uşağın dalısında, deyəsən, odun şələsi vardı.* Mir Cəlal. // Sanki, elə bil.

**DEYİB-DANIŞMA** *is.* Söhbət, söhbət etmə.

**DEYİB-DANIŞMAQ** *f.* Söhbət etmək. *Yetişibsən, indən belə yaraşmaz; Yadlar ilə deyib-danışmaq sənə.* Q.Zakir. *İndiyə kimi Rahimin evi belə şad deyib-danışmaq, oxuyub-gülmək, cavan səsləri eşitməmişdi.* S.S.Axundov.

**DEYİB-GÜLƏN** *f.is.* Söhbətcil, şən, ürəyiaçıq (adam). *Deyib-gülənlərin bəxtiyar səsi; Aygünün qəlbində dinir tar kimi.* S.Vurğun. *Qızların da arasında; Az deyildi deyib-gülən.* M.Dilbazi.

**DEYİB-GÜLMƏ** *is.* Şən bir halda söhbət etmə, şirin söhbət, şənlənmə, sevinmə. *İkram .. yoldaşlarının deyib-gülməsində iştirak etmirdi.* Ə.Əbülhəsən.

**DEYİB-GÜLMƏK** *f.* Şən bir halda söhbət etmək, şirin söhbət etmək; şənlənmək, sevinmək. *İnsan deyib-gülməz vətəndən ayrı.* S.Rüstəm. *Üzlərdə şənlik, deyib-gülmək, çalıb-çağırmaq həvəsi görünür.* Mir Cəlal.

**DEYİCİ** 1. *sif.* Söyləyən, danışan. *Bu sözün deyicisi kimdir?*

2. *is. məc.* Araqarışdıran, şeytanlıq edən. *Adamın min yeyicisi olsun, bir deyicisi olmasın.* (Ata. sözü).

**DEYİCİLİK** *is.* Şeytanlıq, xəbərçilik. ◻ **Deyicilik etmək** – şeytanlıq etmək, xəbərçilik etmək, xəbər vermək. [Dəmirov:] *Görəsən, məndən kim deyicilik eləyib? Yoxsa bu, rayona gələndən mənim üstümə belə bu*

*qədər düşməzdi.* S.Rəhimov. *Bir az qabaq yoldaşın səndən deyicilik elədi.* Ə.Vəliyev.

**DEYİKLƏMƏ** "Deyikləmək"dən *f.is.*

**DEYİKLƏMƏK** *f.* Kiçik yaşında ikən qızı oğlana adaxlamaq, nişanlamaq.

**DEYİKLİ** *is.* Uşaqlıqdan adaxlanmış qız, ya oğlan; nişanlı. [Tarverdi:] *Bu qız .. mənim deyiklimdir.* M.F.Axundzadə. *Cəfərin əmisi qızını, uşaqlıqdan deyiklisi olan Xoşqədəmi ona aldılar.* Ə.Vəliyev.

**DEYİKLİLİK** *is.* Nişanlı olma.

**DEYİL** *əd.* 1. Özündən qabaq gələn sözə inkarlıq, ya zidlik mənası verir. *O, tək deyil. Otaq qaranlıq deyil. – Əziziyəm, nə qandır; Gözdən axan nə qandır; Daş deyil, kəsək deyil; Rəhm eylə, bu ki candır.* (Bayatı). // Eyni mənada şəxs sonluqları ilə işlənilir: **deyiləm, deyilsən, deyildir**. *Araz deyiləm, coşam; Kür deyiləm, qaynaşam; Apar sərraf yanına; Gör nə qiymətli daşam.* (Bayatı). *Deyilik biz nuxalı, gəncəli, ya kim bakılı; Belə boş işlərə vəqf eyləyək ehsanımızı.* M.Ə.Sabir. *Məncə, deyilsən qərib o qürbət ellərdə sən; Yaşayırsan əbədi azad könüllərdə sən.* S.Rüstəm.

2. Feldən sonra gələrək, xəbərlik şəkilçiləri ilə eyni mənada cümlədə xəbər kimi işlənir. *Fəqət Gülbadam çox duaya-zada inanan deyildi.* N.Nərimanov. *Zeynalın evdən soyumasına səbəb yalnız Mehribanın xəstə yatdığı deyildi.* S.Hüseyn. *Ay məndən yüksək deyil; Ay mənimlə tən durur.* R.Rza.

3. "Deyilmi?" şəklində sual məqamında. *Elə deyilmi? Sizi incitdim, deyilmi?*

**DEYİLƏN** *f.sif.* Söylənilən, sözlə, ya yazılı surətdə ifadə edilən. *Qətibənin özü onun* [Səba xanımın] *tamahkarlığını bilirdi, deyilən sözlərin heç birisinə inanmırdı.* M.S.Ordubadi.

**DEYİLİŞ** *is.* Deyilmə tərzi, tələffüz tərzi; tələffüz. *Sözün deyilişi. – Xəlil sözlərin deyilişindən hiss etdi ki, Bəhmən daha samovara baxmır.* İ.Məlikzadə.

**DEYİLMƏ** "Deyilmək"dən *f.is. Qafar .. arvadına güldən ağır söz deyilməsinə dözməyəcəkdi.* Ə.Əbülhəsən.

**DEYİLMƏK** 1. "Demək"dən *məch. Bu barədə heç bir söz deyilməmişdir. Xalq arasında belə deyilir. – Ərlə arvad ünvanına qoşa sağlıqlar; Deyildikcə fikrə getdi, qəm yeyə-yeyə.* S.Vurğun.

2. "Deyilir" formasında – elmi və s. təriflərin sonunda işlədilərək, tərifdəki izahata yekun vurur. *Əşyanın adını bildirən sözlərə isim deyilir.*

**DEYİLMİŞ** *f.sif.* Söylənmiş, sözlə və ya yazılı surətdə ifadə edilmiş. *Deyilmiş söz.*

**DEYİN**[1] *dan.* b a x **deyə**. [Güləsər] *Ağzın isti yerdədi deyin, ərə getmək sənə asan gəlir.* İ.Şıxlı.

**DEYİN**[2] *is. məh.* Vəsiyyət, son ürək sözü.

**DEYİNDİRMƏ** "Deyindirmək"dən *f.is.*

**DEYİNDİRMƏK** *icb.* Deyinməyə məcbur etmək, deyinməsinə səbəb olmaq.

**DEYİNƏN** b a x **deyingən**.

**DEYİNGƏN** *sif.* Çox deyinən, hər şeydən ötrü danışan. *Deyingən adam. – Arvadın deyingəni kişini tez qocaldar.* (Ata. sözü). *Nübar .. tündməcaz, dargöz və deyingən bir qarı idi.* S.Rəhimov.

**DEYİNGƏNLİK** *is.* Deyinmək xasiyyəti. *Deyingənlik pis xasiyyətdir.*

**DEYİNMƏ** "Deyinmək"dən *f.is*.

**DEYİNMƏK** *f.* Narazılığını bildirərək danışmaq, söylənmək, şikayətlənmək. [Tanya:] *İndi yenə də İvanov gələr, başlar deyinməyə ki, laboratoriyada oxuyurlar.* C.Cabbarlı. *..Həpirin hirsi soyumadı. O öz-özünə deyinirdi..* Mir Cəlal.

**DEYİNTİ** *is.* Narazılıq, şikayət, deyinmə.

**DEYİNTİLİ** *sif.* Bir şeydən ürəyi sınmış, deyintisi olan, narazı qalmış, narazı.

**DEYİŞ** *is.* Söz döyüşdürmə.

**DEYİŞDİRMƏ** "Deyişdirmək"dən *f.is.*

**DEYİŞDİRMƏK** *icb*. Deyişməyə məcbur etmək, ara vurmaq; dalaşdırmaq.

**DEYİŞMƏ** *is.* 1. Mübahisə, sözləşmə, söyüşmə, höcətləşmə, dalaşma. *Bu vaxta qədər sükut ilə iki qardaşın çəkişmə və deyişməsini gözləyən Əlisəfa, nəhayət, dilə gəldi.* A.Şaiq. *Raya* [Əminə və qoçunun] *arasında deyişmə olduğunu gördü.* M.S.Ordubadi.

2. *folk.* Aşıqlar arasında yarış və müsabiqə mahiyyətində olan şeirləşmə. *Aşıqların deyişməsi.*

**DEYİŞMƏK** *qarş*. 1. Bir-biri ilə mübahisə etmək, bir-biri ilə sözləşmək, höcətləşmək, söyüşmək. *Onlar hər necə yarızarafat,*

*yarıciddi deyişsələr də, əl-ələ verdilər, qabqacağı birlikdə yuyub-yığışdırdılar.* S.Rəhimov. *Atlılar kimin barəsində isə deyişirdilər.* Mir Cəlal.

2. *folk*. Şeirlə yarışmaq. *Aşıqlar deyişirlər. – ..Meyxanaçılar meyxana deyişərlər, bəzən də aşıq gətirdib nağıl danışdırarlar.* R.Əfəndiyev. *Deyişəndə Hafizə vermir macal; Mən Valehəm ona qürrə, sən nəsən?* Aşıq Valeh. *Çox deyildir, bir az bundan irəli; Mirzəcanla deyişmişdir bir Pəri.* Ə.Cavad.

**DEYR** *is*. [*ər*.] *köhn*. Monastır, kilsə. [Hüseyn xan:] *Axırda yetişdik bir deyrə.* Ə.Haqverdiyev. *..Xanımın atası Şam tərəflərində mövcud olan bir deyrdə ibadət edən məşhur keşişlərdən idi.* M.S.Ordubadi.

**DEZERTİR** *is*. [*fr*.] Özbaşına olaraq öz qoşun hissəsini qoyub gedən, hərbi mükəlləfiyyətdən boyun qaçıran hərbi qulluqçu; fərari. [Qurban:] *Yəqin sən elə, cəbhədə də əmrzad qanmayıbsan, dezertir olmusan!* İ.Şıxlı. // *məc*. Öz vətəndaşlıq borcunu, yaxud xidməti və ya ictimai borcunu yerinə yetirməkdən boyun qaçıran adam.

**DEZERTİRLİK** *is*. Ordudan qaçma, hərbi çağırışdan boyun qaçırma. // *məc*. Öz vəzifəsini, dövləti və ya ictimai borcunu yerinə yetirməkdən boyun qaçırma. *Sənə bu işi tapşırıblar, qaçırsan, demək, dezertirsən.* M.Hüseyn.

**DEZİNFÉKSİYA** [*fr*. des... və *lat*. inficere] Zərərli həşəratın müxtəlif üsullarla məhv edilməsi. *Anbarlarda olan ziyanvericiləri məhv etmək üçün dezinfeksiya üsulundan istifadə edilir. Dezinfeksiya etmək. Dezinfeksiya kamerası. Kül suyu – ucuz və əlverişli dezinfeksiya vasitəsidir. Tabaşirlə ağardılmış divarlar dezinfeksiya edilmiş olur.*

**DEZİNFÉKSİYAÇI** *is*. Dezinfeksiya işi ilə məşğul olan adam. *Dezinfeksiyaçı dəstəsi.*

**DƏ** b a x **da**[1]. *Məhkəmə sədri üçün məsələ aydın idi. Buna baxmayaraq, bir neçə şahidi də danışdırdı.* S.Hüseyn. *Hər şey gözəlləşmədə; Sən də gözəlləş; Bu həyat kimi.* M.Müşfiq.

**DƏB** *is*. [*ər*.] Xalq arasında yayılmış adət, ənənə. *Köhnə dəbdə layla demək köhnəlib artıq; Bəs neyləyək?* M.Araz. *Bilirəm, əziz tutub babaların dəbini. Unutmayıb Babəkin o döyüş məktəbini.* R.Rza. // Moda. [Suğra] *güllü-çiçəkli krepdeşindən lap yeni dəblə tikilmiş uzun bir don geymişdi.* M.Hüseyn. □ **Dəb düşmək** – ümumi adət və vərdiş halını almaq, moda olmaq. [Tahirzadə:] *Məsmə bacı, indi bu çox dəb düşən sözdür.* Mir Cəlal. **Dəb salmaq (gətirmək)** – olmayan bir şeyi xalq arasında yaymaq, adət halına salmaq. *Köhnə kəndə təzə dəb salmaq* (gətirmək). (Məsəl). [Cahan:] *O gün ola, balam, toy edəsən, qız alasan; Evlənmək işini aramıza dəb salasan.* Ü.Hacıbəyov. **Dəbdən düşmək (çıxmaq)** – adət halından çıxmaq; vaxtı keçdiyi, dövrü ötdüyü üçün daha işlənməmək, ortadan qalxmaq. *Biz din və təriqətin dəbdən düşən, hörmət və etibarını itirən .. bir dövrdə dünyaya gəldik.* M.S.Ordubadi.

**DƏBBƏ**[1] *is*. [*ər*.] Bir şey haqqında əldə edilmiş saziş və razılığı pozmaq üçün bəhanə, öz vədindən və sözündən səbəb olmadan imtina etmə. □ **Dəbbə eləmək (çıxarmaq)** – b a x **dəbbələmək**.

**DƏBBƏ**[2] *is*. *köhn*. Ağacdan, sümükdən və s.-dən qayrılmış qab. *Bal, yağ dəbbəsi. – Dəbbədən bal çıxar.* (Ata. sözü). *Görmürsən, nə təhər barıt dəbbəsi kimi partlayır?* S.Rəhimov.

**DƏBBƏÇİ** *is*. Özü razı olduğu və haqqında sazişə gəldiyi şeydən imtina edən, sözündən qaçan adam; cığal.

**DƏBBƏÇİLİK** *is*. Dəbbəçi adamın xasiyyəti.

**DƏBBƏKAR** [*ər*. dəbbə və *fars*. ...kar] b a x **dəbbəçi**.

**DƏBBƏLƏMƏ** "Dəbbələmək"dən *f.is*.

**DƏBBƏLƏMƏK** *f*. Razı olduğu və haqqında sazişə gəldiyi şeydən imtina etmək, sözündən dönmək, qaçmaq. *Söz verdi nigarım məni incitməyə bir də; Tez döndü sözündən, bu açıq dəbbələməkdir.* Ə.Vahid.

**DƏBDƏBƏ** *is*. [*ər*.] Təmtəraq, təntənə, cah-calal, büsat. [Fəxrəddin:] *Həyatdakı xəlifələr bu qədər cəlal və dəbdəbəyə malik olduqları halda, xəlifə namını ləkələyə biləcək bu vəziyyətin qarşısını ala bilmirmi?* M.S.Ordubadi. // Zahiri gözəllik. □ **Dəbdəbə ilə** – təmtəraqla, təntənəli surətdə. *Müdir hündürdən və dəbdəbə ilə: – Yoldaşlar, – deyə iclasa müraciət etdi, – icazə verin, elmi şu-*

*ranın iclasını açıq elan edim.* Ə.Sadıq. *Bir gün də dəbdəbə ilə balaca nəvəynən qabağına çıxacağıq*. Ə.Əbülhəsən.

**DƏBDƏBƏLİ** *sif.* 1. Təntənəli, əzəmətli. *Yurdumun dəbdəbəli, dalğalı bir bayrağı var.* S.Rüstəm. // Təmtəraqlı, çox zəngin. [Firidun] *Öz aləmində Südabənin evini dəbdəbəli bir imarət təsəvvür edirdi.* M.İbrahimov.

2. *məc*. Zahirən gözəl, bəzəkli, təmtəraqlı. *Dəbdəbəli ibarələr*.

**DƏBƏ** *is. tib.* Qasıq yırtıqlığı xəstəliyi; qrıja. // Bu cür xəstəliyi olan adam.

**DƏBƏRDİLMƏ** "Dəbərdilmək"dən *f.is.*

**DƏBƏRDİLMƏK** *məch*. Yerindən tərpədilmək.

**DƏBƏRƏGÖZ** *sif.* Gözü qabağa çıxıq olan. *Dəbərəgöz adam. – Bığı xınalı, dəbərəgöz bir qəssab kötüyün üstündə ət doğrayırdı.* Mir Cəlal.

**DƏBƏRİLMƏ** "Dəbərilmək"dən *f.is.*

**DƏBƏRİLMƏK** bax **dəbərdilmək**. *Heç bir şey yerindən dəbərilməyəcəkdir*. M.S.Ordubadi.

**DƏBƏRİŞMƏ** "Dəbərişmək"dən *f.is.*

**DƏBƏRİŞMƏK** *f.* 1. Tərpəşmək, tərpəşməyə başlamaq (çoxları haqqında). *Bu qədər qışqırığa durdu qonum-qonşu tamam; Dəbərişməz də, veribdir, deyəsən, can, ölüb...ə!* M.Ə.Sabir. *Paşa duruxub üzünü dəbərişməkdə olan adamlara tutdu.* S.Rəhimov.

2. Biz-biz durmaq (tük haqqında). *Hacıyev cəbhədə olduğu bu aylar ərzində hələ tükünün dəbərişdiyi, biz durduğu olmamışdı.* Ə.Əbülhəsən.

**DƏBƏRMƏ** "Dəbərmək"dən *f.is.*

**DƏBƏRMƏK** *f.* 1. Yerindən tərpənmək, tərpənmək, yerindən durmaq, qalxmaq. *Asta-asta dəbərib qurdalaşırsan, deyəsən; Bəzi əfsanəçilərlə yanaşırsan, deyəsən.* M.Ə.Sabir. // Yerindən durmaq, qalxmaq. *Qaçmaq üçün dəbərdi, tez aldı pişik kimi daban*. Ə.Nəzmi.

2. *məc*. *dan*. Cücərməyə başlamaq, görünməyə başlamaq. *Toxumlar dəbərdi*.

**DƏBƏRTMƏ** "Dəbərtmək"dən *f.is.*

**DƏBƏRTMƏK** *f.* Yerindən tərpətmək, yerindən oynatmaq. *..Bombaların gurultusu hərdənbir yatmışları, deyəsən, yuxudan dəbərtdi.* C.Məmmədquluzadə.

**DƏBİLQƏ** *is.* Döyüşçülərin başlarına qoyduqları metaldan tökülmüş papaq; taskülah. [Molla Cabbar:] *Bir dənə uzun bayraq, dəbilqədən, qalxandan, qılıncdan eşşəyə yükləyib düşəcəyəm kəndbəkənd.* Ə.Haqverdiyev. *Qılınc və nizələrin əsər etmədiyi dəmir geyimlər və polad dəbilqələr ağır əmud zərbələrinin altında əzilərək bədənlərə yeriyirdi.* M.S.Ordubadi.

**DƏBİLQƏLİ** *sif.* Başına dəbilqə qoymuş. *Dəbilqəli döyüşçü.*

**DƏBİR** *is.* [*ər.*] *köhn.* 1. Kargüzar.

2. Xəttat, kalliqraf.

3. Müəllim.

4. Mühasib.

**DƏC** *is. məh.* 1. Bir yerə yığılmış arpa, buğda və s.-yə əl toxunmasın deyə, onu nişanlamaq üçün taxtadan və s.-dən qayrılan iri möhür (nişan). *Xırmana qayıtdıqda hamını heyrət aldı. Doğrudan da, ehram buğdanın dəci pozulmuşdu.* M.İbrahimov. ◻ **Dəc eləmək** – bütövləmək, ağzınacan doldurmaq, ləbələb etmək. **Dəc qalmaq** – bütöv qalmaq, toxunulmamış qalmaq. *...Sirkə ağzı tıxaclı, dəc qalıb stolun üstündə.* C.Məmmədquluzadə.

2. Taxılı yaxşı döysün deyə, vəlin altına vurulan xırda çaxmaq daşları və ya dəmir parçaları.

**DƏCCAL** *is.* [*ər.*] Dini etiqadlara görə, guya qiyamətdə zühur edərək adamları azdırıb dindən uzaqlaşdıracaq əfsanəvi şəxsiyyət. [Molla Vəli:] *Yazırlar ki, dəccalın qoşunlarının alınlarında bircə gözləri olacaq.* Ə.Haqverdiyev. // *məc*. Yalançı, fırıldaqçı adam haqqında.

**DƏCƏL** *sif.* 1. Dinc oturmayan, rahat durmayan, nadinc. *Görsəm çamırlı bir küçədə oynayır haçaq; Çılpaq, ayaqyalın, başaçıq bir dəcəl uşaq.* A.Səhhət. *Dəcəl uşaq kimi minib; Dəniz ləpələrinə, yellənir.* R.Rza. *Heç on beş il bundan qabaqkı dəcəl uşağa oxşamır*. M.İbrahimov. // İs. mənasında. *Harda gül görsə; Dəcəllər dərir.* M.Seyidzadə. *Rizvan ilə beş dəcəl; Hər gün burda oynayır.* M.Dilbazi.

2. Cavan heyvanlar haqqında. *Qaşqa day xam atların ən dəcəli idi.* İ.Əfəndiyev. *Bayaqkı oynaq və dəcəl tula, quyruğunu*

*bulaya-bulaya on addım irəlidə .. gedirdi.* M.Rzaquluzadə.

**DƏCƏLƏ** *is. məh*. Quş cələsi, quş tutmaq üçün tələ. *Quşu dəcələ ilə tuturlar.*

**DƏCƏLLƏŞMƏ** "Dəcəlləşmək"dən *f.is.*

**DƏCƏLLƏŞMƏK** *f.* Daha da dəcəl olmaq, nadinc olmaq, dəcəllik etmək.

**DƏCƏLLİK** *is.* Nadinclik. *Dəcəllik etmək. Uşaq dəcəlliyi. – Zeynəb dəcəllik etməyi, kiçik bir bəhanə tapıb adamlara sataşmağı, müsahibinin utandığını, .. gülməyi çox sevərdi.* İ.Şıxlı.

**DƏCLƏMƏ** "Dəcləmək"dən *f.is.*

**DƏCLƏMƏK** *f. məh*. 1. Dəstə ilə yığmaq, nizamla toplamaq. *Dəftərləri dəcləmək.*

2. Sıra ilə deşmək və ya sıra ilə daş və ya mıx çaxmaq. ..[Yaqubcanın] *əlindən min peşə gələrdi: dəyirman daşı dişəmək, vəl dəcləmək...* S.Rəhimov.

3. Bir yerə yığılmış arpa, buğda və s.-yə toxunmasınlar deyə onu nişanlamaq. *Taxılı dəcləmək.*

**DƏCLƏNMƏ** "Dəclənmək"dən *f.is.*

**DƏCLƏNMƏK** *məch. məh.* 1. Dəstə ilə yığılmaq, səliqə ilə toplanmaq.

2. Sıra ilə daş və ya mıx çalınmaq. *..Təzə dəclənmiş vəlin iti dişləri açılan yerləri cızıq-cızıq edirdi.* S.Rəhimov.

3. **Dəclə** 1-ci mənada nişanlanmaq.

**DƏDƏ** *is.* 1. Ata. *Dədə görməyib, elə bilir ki, Şaqqulu da bir dədədir.* (Ata. sözü). [Qurban:] *Dədəm öldü, mən də qaldım on altı-on yeddi yaşında.* Ə.Haqverdiyev. *Dədəmin övladı olmamağına görə nəzir eyləyir ki, bir qızım olsun, seyidə verim.* Çəmənzəminli. // Ataya müraciət. [Əmiraslan dedi:] *Dədə! Mən məktəbə getməyəcəyəm. Orada molla adamın ayağını falaqqaya salıb döyür.* S.S.Axundov.

2. Ustad aşıq, ustad. *De, hara sığışar, hara, ey zaman; Bu boyda təhqirə xalqın dözməsi; Dədə Qorqud kimi dədəsi olan; Millətin özünə dədə gəzməsi.* B.Vahabzadə.

◊ **Dədəsi yanmaq** – b a x **atası yanmaq** (**"ata"**da). *Çit almaqdan dədəm yandı; Yudun, yırtdın, xarab etdin.* M.Möcüz. **Dədəsinə od vurmaq** – b a x **dədəsini yandırmaq**. *Gərək o adamın dədəsinə od vurasan və elə vurasan ki, heç bilməsin ki, bəla güneydən gəldi, ya quzeydən.* N.Vəzirov. **Dədəsini yandırmaq** – b a x **atasını yandırmaq** (**"ata"**da). *Yadından çıxartma ki, kirpinin də hər bir tərəfi tikandır, amma balaca qarışqa onun dədəsini yandırır.* "M.N.lətif.". *Meşənin içində bir ağacın oyuğunda pişik göyərçini gizlətdi, dedi: – Sən dur burada, mən gələnə kimi sən buradan çıxsan, dədəni yandıraram.* (Nağıl).

**DƏDƏ-BABA** *is.* 1. Ulu babalar, əcdad. *Dədə-baba qaydasınca. – Kassirlə dədə-babadan qanbir qohum çıxanlar bir-birinə yapışmışdılar.* Mir Cəlal.

2. **Dədə-babadan** şəklində *zərf* – babalardan, qədimdən, çox köhnədən. ☐ **Dədə-babadan qalma** – çox köhnə, qədim. [Hacı Murad:] *Yox, onlar da dədə-babadan qalma adətlərdir.* S.S.Axundov.

**DƏDƏLİ** *sif.* Atası olan, atalı. *Elədimi mən yetim; Sən dədəli, mən yetim; Özün murada yetdin; Dua elə, mən yetim.* (Bayatı).

**DƏDƏLİK** *is.* Atalıq, ögey ata. *..Nəcəfqulunu da hərdənbir döyərdim və bu da qaçardı dədəliyinə şikayətə.* C.Məmmədquluzadə.

**DƏDƏMALI** b a x **dədəverdi**. [Molla Nəsrəddin:] *Bu qızılları ki sayırdım, o mənim arvadımın dədəmalısıdır.* "M.N.lətif.".

**DƏDƏSİZ** *sif.* və *is.* Atasız. *Əziziyəm təndirə; Odun qala təndirə; Dədəsizin nə həddi; Dədəliyə tən dura?* (Bayatı).

**DƏDƏVERDİ** *is. məh*. Arvadın öz atası evindən gətirdiyi mal, müxəlləfat, cehiz. *Ay balam, o, arvadın dədəverdisidir. Siz də dünyada dava axtarmağa lap azarlısınız.* S.Rəhimov.

**DƏF**[1] *is.* [*fars.*] Xanəndə və dəfçalanların barmaqla çaldıqları, bir üzünə dəridən sələ çəkilmiş sağanaqdan ibarət çalğı aləti; qaval. *Dəf çalmaq* (*vurmaq*). *Zınqırovlu dəf. – Çalsın dəfü-ney, naləvü-əfğan yola düşsün.* M.P.Vaqif. *Ənbər saçılır, qafileyi-ud gəlibdir; Guya ki, genə çəngü dəfü ud gəlibdir.* S.Ə.Şirvani.

**DƏF**[2] [*ər.*] 1. Özündən uzaqlaşdırma, sovuşdurma, rədd etmə. [Vəli:] *Bizim borcumuz bunları dəf üçün hər yolla çalışmaqdır.* Ə.Haqverdiyev. ☐ **Dəf etmək (eləmək)** – ortadan qaldırmaq, bərtərəf etmək. [Əziz bəy:] *Amma Ağa Həsən kimi nadürüstlərin*

*hiyləsini və zərərini dəf edə bilər.* M.F.Axundzadə. **Dəf olmaq** – uzaqlaşmaq, sovuşmaq, başdan olmaq, rədd olmaq, yox olmaq, ortadan qalxmaq.

2. Həmləni geri qaytarma, hücumun qarşısını alma, müqavimət göstərmə. □ **Dəf etmək** – qaytarmaq, qarşısını almaq (hücumun və s.). *Qoşun düşmənin hücumunu dəf etməyə çalışırdı.* Çəmənzəminli. *..Nəhayət, ayın iyirmi doqquzundakı həmləsi də dəf edildikdən sonra, düşmən böyük tələfatla geri çəkilmişdi.* Ə.Əbülhəsən.

**DƏF**[3] *is. məh.* Xəmiri üstünə qoyub təndirə yapmaq üçün işlədilən alət.

**DƏFÇALAN** b a x **dəfçi** 1-ci mənada.

**DƏFÇİ** *is.* 1. Dəf çalan adam; dəfçalan. *Dəfçi döşünü irəli verib başını dik tutaraq, dəfin qabırğasına döşəyirdi.* M.Süleymanov.

2. Dəf qayıran usta.

**DƏFÇİLİK** *is.* Dəf çalmaq işi, dəfçalanın peşəsi, sənəti.

**DƏF-DUMBUL** *is.* Çalğı mənasında.

**DƏFƏ** *zərf* [*ər.*] 1. Kəmiyyət bildirən sözlə birgə işləndikdə bir işin, hərəkətin, hadisənin hər bir momentini, təkrarını bildirir; kərə. *Bir neçə dəfə. Çox dəfə. – On dəfə ölç, bir dəfə biç.* (Ata. sözü). *Yüz dəfə xəzan olmuş idi bağü baharim; Bu bağı görüb fəsli-gülüstan genə gəldim.* S.Ə.Şirvani. *Şərəfoğlu Muğanda iki dəfə uzun müddət yaşayıb işləmişdi.* M.İbrahimov.

2. Sıra sayları və işarə əvəzlikləri ilə birgə işləndikdə, təkrar edilən eyni hadisələrin, işlərin, keyfiyyətlərin və s.-nin birisini ifadə edir. *İkinci dəfə təkrar etmək. – Qatı qaranlığın dərələrdə daha çox olduğunu Əbil birinci dəfə görürdü.* Ə.Vəliyev. □ **Bir dəfə** – günlərin birində, haçan isə keçmişdə. *Bu gülünc həyatdan nə çıxsın dedim; Bir dəfə özümü vurmaq istədim.* M.Müşfiq. **Bir dəfə də olsa** – heç, qətiyyən, əsla, heç vaxt. *Karvanbaşı duruxdu, aşağıdan yuxarıya dik onun gözünün içinə baxan bu kafir bir dəfə də olsa gözlərini qırpmamışdı..* Ə.Məmmədxanlı. **Çox dəfə** – dəfələrlə, çox vaxt, təkrarən. **Əvvəl dəfələrdə** – ilk çağda, ilk vaxtlarda, ibtidada. *Bəlkə quruda da rast və möhkəm yerimək əvvəl dəfələrdə çətin olacaqdır.* F.Köçərli. **Hər dəfə** – həmişə, hər vaxt, daim. *Kirpi dayı, hər dəfə keçməz belə; Öz gələcək günlərini fikr elə..* Ə.Vahid. **O dəfə** – onda, o vaxt. *Nurcabbar çarpayıda yerini rahatlayıb dəftərin bir neçə səhifəsini çevirdi. – O dəfə harda qaldıq? – dedi.* İ.Məlikzadə.

**DƏFƏAT** [*ər.* "dəfə" *söz. cəmi*] *köhn.* Adətən "ilə" qoşması (bitişik yazıldıqda – la) ilə birlikdə – dəfələrlə, bir neçə kərə. *Bu mətləb barəsində dəfəat ilə yazılıbsa da, heyfən ki, yazıçıların nalə və fəryadı sahibi-ixtiyarların və dadrəslərin qulaqlarına yetişməyibdir.* F.Köçərli. [Məkkədən qayıtmaqda olan hacı:] *Bu, Məkkə türbətidir. Bu türbətin tələtüm yatırtması dəfəatla imtəhan olunubdur.* Ə.Haqverdiyev.

**DƏFƏ-DARAQ** *is. dan. zar.* Ləvazimat, dəsgah (3-cü mənada). *Bu iş üçün dəfə-daraq lazım deyil.*

**DƏFƏLƏRLƏ** *zərf* 1. Bir neçə dəfə, təkrarən. *O, dəfələrlə mükafatlandırılmışdır. Dəfələrlə xəbərdarlıq etmək. – ..Daşı Məsmə qarı dəfələrlə gəlib anadan alıb aparmışdı və bu yupyumru hamar, qara daşla dəfələrlə böyük bir teşt içində abqora üçün qora əzmişdi...* Ə.Məmmədxanlı.

2. Qat-qat, çox-çox. [Zeynalın] *elmi, biliyi dəfələrlə özünün bildiklərindən artıqdı, çoxdu.* S.Hüseyn.

**DƏFƏTƏN** *zərf* [*ər.*] *köhn.* Dərhal, o saat, əlüstü, birdən, bir dəfədə. *Xlestakov qızışıb deyir: – Mənim hökmlərim dəfətən cari olur!* F.Köçərli.

**DƏFİNƏ** *is.* [*ər.*] Yer altında gizlədilmiş, yaxud gizli halda qalan xəzinə. *Heydərbaba, səndə dəfinələr var; Dağlar vadiəsi xəzinələr var..* Şəhriyar. // *məc.* Yeraltı sərvət mənasında. *Biz açdıq torpağın altında qalmış; Gün üzü görməmiş dəfinələri.* S.Vurğun. *Çocuq açılmamış bir dəfinədir; İnsan dövlət üçün bir xəzinədir.* M.Müşfiq.

**DƏFİNƏLİ** *sif.* Dəfinəsi olan, xəzinəsi olan; çox zəngin yeraltı sərvətləri olan. *Dəfinəli Xəzərin neftli bağrı sökülür.* İ.Səfərli.

**DƏFN** *is.* [*ər.*] Ölünü basdırma, torpağa təslim etmə. *Mirzənin ölməyinin xəbəri şəhərə yayıldı. Oğlanlarının xatirəsi üçün şəhərin tüccarı və əyanı onun dəfnində iştirak edirdi.* Ə.Haqverdiyev. *Xanların yaralandığı səhnə*

*və dəfn mərasimi Tahirin könlündə silinməz bir iz buraxdı.* M.Hüseyn. ◻ **Dəfn etmək** – 1) basdırmaq, torpağa təslim etmək (ölünü). *..Yol kənarında köhnə xaraba bir qəbiristan vardır, kəndlilər burada ölülərini dəfn edirlər.* S.S.Axundov. *Xədicə əlavə etdi: – Üçüncü və axırıncı vəsiyyətim də budur ki, məni qəbiristanda basdırmayınız. İki bağın mərzindəki o böyük qarağacın altında dəfn ediniz.* S.Hüseyn; 2) *məc.* vaxtı keçmiş, əhəmiyyətini itirmiş bir şey hesab edərək, həmişəlik yaddan çıxarmaq, ortadan qaldırmaq. *Köhnə adətləri dəfn etmək. – İçində dəfn etdi dərdisərini; O bildi, yox imiş yazıya pozu.* B.Vahabzadə. **Dəfn olmaq (edilmək)** – basdırılmaq. *Bizim Novruz bayramının ikinci günü Petroqrad şəhərində azadlıq yolunda şəhid olan azadlıq qurbanları dəfn olublar.* C.Məmmədquluzadə.

**DƏFNƏ** *is.* 1. *bot.* Yarpaqları yeyinti və konserv sənayesində istifadə olunan həmişəyaşıl ağac və ya kol. *Dəfnə ağacına Zaqafqaziyada çox təsadüf edilir. – Dəfnə bitkisinin meyvələri xırda, qararəngli, birtoxumlu və yumurta formalıdır.* İ.Axundzadə.

2. *məc. tənt.* Zəfər, qalibiyyət, şöhrət, mükafat rəmzi olaraq bu ağacın budaqcıqlarından düzəldilən çələng, tac.

**DƏFN-KƏFN** [*ər.*]: **dəfn-kəfn etmək** *köhn.* – ölünü kəfənləyib basdırmaq. *Comərd dədəsini dəfn-kəfn eləyib basdırdı.* (Nağıl).

**DƏFTƏR** *is.* [*ər.* əsli *yun.*] 1. Yazı yazmaq, yaxud rəsm çəkmək üçün kitab şəklində tikilmiş eyniölçülü kağız dəstəsi. *Şagird dəftəri. Cib dəftəri. Ümumi dəftər. Rəsm dəftəri. – Gəncliyimin ilk xatirə dəftərində; Bu nəğmənin qırıq-qırıq sətirləri..* M.Araz. *Bilirsən ki, necə anar; Qələm məni, dəftər məni!* M.Müşfiq.

2. Haqq-hesab və hesabat işlərini yazmaq üçün müxtəlif formada cızıqlanmış, kitab şəklində eyni ölçüdə kəsilmiş kağız dəstəsi. [Məşədi:] *Dükan sahibi isə dəftər və çötgəni çıxarıb hesaba məşğul olur.* Ə.Haqverdiyev. *Hacı öz dükanlarından birini kontor kimi düzəldib buraya bəzi kitab, dəftər və kağız-kuğuz qoymuşdu.* S.Şamilov. ◻ **Dəftərdən düşmək** – yaddan çıxıb adı dəftərə yazılmamaq, bir yerə qeyd edilməmək. **Dəftərə düşmək** – müəyyən məqsəd üçün dəftərə qeyd edilmək. *Onun adı dəftərə düşdü. – Hər nə istəsəniz verək, ancaq o, idarənin dəftərinə düşübdür!* S.Rəhimov.

**DƏFTƏRÇƏ** *is.* Kiçik dəftər, cibdə gəzdirilən dəftər; bloknot. *Bahadır dəftərçəsini xeylaq yazandan sonra meşədə gəzirdi.* N.Nərimanov. *Vəli döş cibindəki bütün kağızları çıxartdı, balaca bir yazı dəftərçəsindən başqa hər şeyi stolun üstünə qoydu.* M.Hüseyn.

**DƏFTƏR-ÇƏRƏKƏ** *top.* Dəftər və kitabçalar, kağızlar.

**DƏFTƏRÇİ** b a x **dəftərdar**.

**DƏFTƏRÇİLİK** b a x **dəftərdarlıq**.

**DƏFTƏRDAR** *is.* [əsli *yun.* və *fars.*] 1. *rəs.* Dəftərxana işçisi, idarəyə gələn və oradan çıxan kağızları dəftərə qeyd etməklə məşğul olan işçi. *Dəftərdar kağızı Ağarzaya tərəf uzadıb içəri qayıtdı.* Mir Cəlal.

2. *köhn.* Mühasib, hesabdar.

**DƏFTƏRDARLIQ** *is. rəs.* Dəftərdarın işi, vəzifəsi. *İdarədə dəftərdarlıq etmək. Dəftərdarlığa aid işlər.*

**DƏFTƏRXANA** *is.* [əsli *yun.* və *fars.*] Bir idarənin kargüzarlıqla məşğul olan şöbəsi. *Mirzə Səfər .. qəza dəftərxanasında qulluq edərdi.* Ə.Haqverdiyev. [İvan bəy:] *İskəndər, gəl, bu kağızları apar, ver dəftərxanaya..* N.Vəzirov. [Qumru:] *Nə yaxşı ki, bu, dəftərxana adamlarının yadına düşmür..* Mir Cəlal.

**DƏFTƏRXANAÇI** *is.* Dəftərxana işçisi. [Qədir] *qollarını bir-birinə keçirib dəftərxanaçının üzünə mənalı-mənalı baxdı.* Mir Cəlal.

**DƏFTƏRXANAÇILIQ** *is.* Dəftərxanaçının işi, peşəsi, vəzifəsi.

**DƏFTƏR-KİTAB** [*ər.*] B a x **dəftərçərəkə**.

**DƏFTƏRQAZI** *is. məh.* Yağlı və yumurtalı xəmirdən tavada bişirilib şəkər və sumaqla yeyilən qoğal; bişi.

**DƏĞDƏĞƏ** *is.* [*ər.*] *klas.* 1. Bihudə təlaş və iztirab, qorxu, həyəcan; gurultu-patırtı. *Fariq eylə məni bu dəğdəğeyi-dünyadən.* S.Ə.Şirvani.

2. Dərd, başağrısı, qayğı, əndişə, fikir. *Hərgah doğrusunu bilmək istəyirsən, ərz edim: – Başımın ən bala mərtəbəsində bu*

*hində un və buğda fikridir. ...Ondan da aşağıda odun və kömür dəğdəğəsidir.* F.Köçərli.

3. Yoldan çıxaran, başdan çıxaran şey, azdırıcı şey. *Heyfa ki, bizim bu vəsvəseyi-şeytan və dəğdəğeyi-insan ilə malamal olan zamanımızda belə dostların vücudu kimyaya dönübdür.* F.Köçərli. □ **Dəğdəğə vermək** – yoldan çıxarmaq, azdırmaq, başdan çıxarmaq. *Sən deyildinmi, mənə dəğdəğə verən və mənə deyən ki, apar bu kağızı, uyezd naçalniki Vinokurova ver?* Ə.Haqverdiyev. [Xanpəri:] *Birdən şeytan mənə dəğdəğə verir ki, dur get, o Gülşəndir, nədir, tut onun başını yol.* Ə.Vəliyev.

**DƏĞDƏĞƏÇİ** *sif.* və *is. dan.* Vəsvəsəli, səksəkəli (adam).

**DƏĞDƏĞƏLİ** *sif.* Səbəbsiz yerə təlaş edən və qorxan; vəsvəsəli, səksəkəli. *Mən isə utancaq və dəğdəğəli bir uşaq olduğumdan, anamın yanında büzülüb durur*(*dum*). A.Şaiq.

**DƏHAN** *is.* [*fars.*] *klas.* Ağız. *Sədəf dəhanından yüz min dürr saçar.* S.Vurğun.

**DƏHBAŞI** *is. köhn.* Gecə qarovulçuları üstündə gəzən və onlara nəzarət edən şəxs. *Məhəllənin dəhbaşısı.*

**DƏHƏN** [*fars.*] B a x **dəhan**. *Qismət olsa, gələr Yəməndən; Qismət olmasa, çıxar dəhəndən.* (Ata. sözü). *Qönçə dəhəni çəməndə xəndan.* Xətayi.

**DƏHLƏMƏ** "Dəhləmək"dən *f.is.*

**DƏHLƏMƏK** *f.* Səsləmək və b. yolla heyvanı hərəkətə gəlməyə məcbur etmək. *O, qabağa keçib öküzləri hayxırdı, atı dəhlədi.* S.Rəhimov.

**DƏHLİZ** *is.* [*fars.*] 1. Ev qapısı ilə otaqların qapıları arasında olan üstüörtülü aralıq; koridor. *Yığılıb dağ kimi hər yanda kitab; Evdə, dəhlizdə və eyvanda kitab.* M.Ə.Sabir. *Əyləşir qocalar ikibir, üçbir; Qocalar evinin dəhlizlərində.* B.Vahabzadə. // Küçə qapısı ilə ev, yaxud evlə həyət arasında üstüörtülü yol. *Burası qəsrin həyatini küçə qapısı ilə bir-birinə vəsl edən dəhlizdən ibarət idi.* M.S.Ordubadi.

2. *məh.* Böyük otağa yapışıq kiçik otaq.

3. *məh.* Keçid. .. *Dərənin arxasındakı dəhlizdə üst-üstə yığılan pətəklərdən .. arılar dəstə-dəstə çıxırdılar..* S.Rəhimov.

4. *is. tib.* Qulaq boşluğu, orta qulaq.

**DƏHLİZCİK** *is.* Kiçik dəhliz.

**DƏHNƏ[1]** *is.* [*fars.*] Yüyənin və ya cilovun atın ağzına salınan dəmir hissəsi; cövzə. *At dəhnəni çeynəyə-çeynəyə irəli atıldı.* – [Boz at] *ağzını canavar kimi açıb cilovun dəhnəsini gəmirir, paçasını gen ataraq qaçırdı.* Ə.Vəliyev.

**DƏHNƏ[2]** *is.* [*fars.*] 1. Ana xətdən ayrılan arxın, şırımın və s.-nin başlanğıcı. *Bu dəhnə sel dəhnəsidir, Lil hökmran, qaya əsir...* M.Araz. *Görürəm Tərtər HES-in köpürdüyünü; Polad dəhnədə.* M.Müşfiq.

2. Dəyirman arxında suyun yığıldığı yer; bənd. *Dəyirmanı yatırtdıqda suyu dəhnədən arxa buraxdılar.* S.S.Axundov.

**DƏHNƏLƏMƏ** "Dəhnələmək"dən *f.is.*

**DƏHNƏLƏMƏK** *f.* Dəhnəni atın ağzına keçirmək (b a x **dəhnə[1]**).

**DƏHNƏLƏNMƏ** "Dəhnələnmək"dən *f.is.*

**DƏHNƏLƏNMƏK** *məch.* Yüyənin dəhnəsi ağzına keçirilmək (atın).

**DƏHNƏLİ** *sif.* Dəhnəsi olan.

**DƏHR** *is.* [*ər.*] *klas.* 1. Dünya, aləm, təbiət. *Dəhrdə oldu mənə dildarü-dilbər bir tüfəng.* M.P.Vaqif. *Dəhrdə etmə iftiraqə həvəs; İftiraq ilə kəslər olmuş pəs.* S.Ə.Şirvani.

2. Zaman, dövr. *Can ilə həm cəhan bənəm, dəhr ilə həm zəman bənəm; Gör bu lətifəyi ki, bən dəhrü-zəmanə sığmazam.* Nəsimi. // *məc.* Qismət, tale.

**DƏHRƏ** *is.* Ağac budamaq, yaxud çox qalın olmayan ağacları kəsmək üçün burnuəyri kəsici alət. *Yox, əfəndim, bu məsələlərdə dəhrə ilə müharibəyə çıxmaq olmaz.* N.Nərimanov. *..Abbas dəhrəsini və sicimini götürüb ayağa qalxdı..* S.S.Axundov. [Yusif] *iti dəhrə ilə bir neçə budağı kəsib yerə tökdü.* Ə.Abasov. // Ət doğramaq (döymək) üçün alət; ətdöyən, qiyməkeş. *Mətbəxdən dəhrə, taxta səsi gəlir.* Ə.Haqverdiyev.

**DƏHRƏBURNU** *is.* Toxumalarda və kəlağayıların üzərində dəhrə burnu şəklində naxış.

**DƏHRƏBURUN** *sif.* Burnunun ucu dəhrə kimi yuxarı qalxmış, burnu dəhrəyə oxşayan. *Dəhrəburun adam.*

**DƏHRƏQUYRUQ** *is. zool.* Quyruğu dəhrəyə oxşayan böcək.

**DƏHRƏLƏMƏ** "Dəhrələmək"dən *f.is.*

**DƏHRƏLƏMƏK** *f.* Dəhrə ilə doğramaq, kəsmək. *Ağacların budaqlarını dəhrələmək.*

**DƏHRƏLƏNMƏ** "Dəhrələnmək"dən *f.is.*

**DƏHRƏLƏNMƏK** *məch.* Dəhrə ilə doğranmaq, kəsilmək.

**DƏHRƏLƏTMƏ** "Dəhrələtmək"dən *f.is.*

**DƏHRƏLƏTMƏK** "Dəhrələmək"dən *icb. Qurumuş budaqları dəhrələtmək.*

**DƏHRƏLİ** *sif.* Dəhrəsi olan, əlində dəhrə. *Belli, dəhrəli, yabalı, külünglü, kürəkli adamlar bir-birinə qarışmışdılar.* Ə.Vəliyev. *Bir nəfər əli dəhrəli adam tənbəl-tənbəl işləyirdi.* Ə.Əbülhəsən.

**DƏHRƏŞƏKİLLİ** *sif.* Görünüşcə dəhrəyə oxşayan, dəhrə kimi.

**DƏHRİ, DƏHRİYUN** *is.* [*ər.*] *köhn.* Axirətə inanmayan və hər şeyin bu dünyada olduğunu iddia edən adam. *Nə hüluliyəm, nə dəhri, nə kənariyəm, nə bəhri; Nə riyaziyəm, nə cəbri, hələ ləngü ləngü ləngəm.* Nəbati.

**DƏHŞƏT** *is.* [*ər.*] 1. Qorxunc bir şey və ya böyük bir təhlükə, hadisə və s. qarşısında doğan şiddətli qorxu hissi; vahimə. *Muradın gözləri dəhşətdən böyüdü.* S.Hüseyn. *Eşikağası dəhşətdən gözlərini yumub qaçdı xanın yanına.* Çəmənzəminli. ☐ **Dəhşət almaq, dəhşətə düşmək** – bərk qorxuya düşmək, dəhşətlənmək. **Dəhşət vermək** – dəhşət oyandırmaq, dəhşət ifadə etmək, vahimələndirmək. [Orxan:] *Allah, Allah, yenə çatıldı qaşlar; Dəhşət verir qartalvari baxışlar.* H.Cavid. **Dəhşətə gətirmək (salmaq)** – bərk qorxu oyatmaq, dəhşətləndirmək. *Katibin kabinetindən gələn xəbərlər Sabitovu dəhşətə gətirdi.* S.Şamilov.

2. Bu cür bir hiss doğuran hadisə, vəziyyət, mənzərə (bu mənada çox vaxt cəm şəklində işlənir). *Bu nizələr, bu süngülər muzeylərdə pas tutacaq; İnsan oğlu yaratdığı dəhşətləri unudacaq.* S.Vurğun. *Əsirlik – dəhşətlərin ən böyüyü idi.* Ə.Əbülhəsən.

3. Faciə, çıxılmazlıq. *Öz vəziyyətinin dəhşətini hiss etdi.*

**DƏHŞƏTAMİZ** [*ər.* dəhşət və *fars.* ...amiz] b a x **dəhşətəngiz**. ...*Əxlaqsızlığın dəhşətamiz və çılpaq səhnələri açıldı.* M.İbrahimov.

**DƏHŞƏTƏNGİZ** *sif.* [*ər.* dəhşət və *fars.* ...əngiz] Dəhşətli, dəhşət doğuran; qorxunc. *Sübh açılanda şahi-zalim və birəhmin hökmünə görə gərək adamlar kəlləsindən minarə qurulaydı. Vaqifin başı haman dəhşətəngiz minarənin qülləsini müzəyyən edə idi.* F.Köçərli.

**DƏHŞƏTLƏNDİRMƏ** "Dəhşətləndirmək"dən *f.is.*

**DƏHŞƏTLƏNDİRMƏK** *f.* Dəhşətə salmaq, son dərəcə qorxutmaq.

**DƏHŞƏTLƏNMƏ** "Dəhşətlənmək"dən *f.is.*

**DƏHŞƏTLƏNMƏK** *f.* Dəhşətə düşmək, son dərəcə qorxmaq.

**DƏHŞƏTLİ** *sif.* 1. Dəhşət doğuran, son dərəcə qorxunc; müdhiş. *Əgər bu, həqiqətə çevrilsəydi, gör Müqim bəy Cavanşir üçün necə dəhşətli faciə üz vermiş olardı.* S.Rəhimov. *Kambayev dəhşətli sonun yaxınlaşdığını görürdü.* S.Rəhman. // İnsanı dəhşətə salan, dəhşət hissi oyadan, faciəli, çox ağır. *Dəhşətli mənzərə. – "Nadir şah" faciəsində yazıçı .. saray intriqalarının ən dəhşətli səhnələrini təsvir edir.* M.Arif.

2. Çox pis. *Dəhşətli hava. Dəhşətli külək.*

3. Çox güclü, şiddətli, dözülməz. *Dəhşətli ağrı. – Kül rəngli havada toz-duman var; Dəhşətli soyuq, ayaz, boran var.* A.Şaiq. *Xavər dörd aylıq dəhşətli əzablardan arıqlamış, ordları batmış Kərimxana baxır, gözünü sarıqlı gözündən çəkə bilmirdi.* M.İbrahimov.

**DƏHŞƏTNAK** [*ər.* dəhşət və *fars.* ...nak] b a x **dəhşətəngiz**.

**DƏHYEK** *is.* [*fars.*] *tar.* Keçmişdə kəndlilərin feodala, bəyə və ya mülkədara məhsulun onda biri miqdarında natural şəkildə verdikləri vergi. *Yığmışıq dəhyekini, boşlamışıq bağlarını; Qış üçün xoşlamışıq Tiflis oyuncaqlarını.* M.Ə.Sabir. *Dirəndi, istədi həm mülkədar dəhyekini.* Ə.Nəzmi.

**DƏXALƏT** *is.* [*ər.*] *köhn.* İşə qarışma, müdaxilə etmə. ☐ **Dəxalət etmək (eləmək)** – qarışmaq, müdaxilə etmək. *Dəccal da edir cümlə işə indi dəxalət; Qanun adı dillərdə fəqət qaldı, daduşcan!* "Mol. Nəsr." *Olmaz bu ki, hər əmrə dəxalət edə fəhlə; Dövlətli olan yerdə cəsarət edə fəhlə.* M.Ə.Sabir.

**DƏXİ** *köhn.* 1. B a x **da**[1] 1 və 2-ci mənalarda. *Saqiya! Saldı qəm əldən məni, bir badə yetir; Həm bu dünyada mənə, həm dəxi üqbadə yetir.* Heyran xanım. *Sona dəxi* [Ba-

hadırın] *halını hiss etdi.* N.Nərimanov. *İndi dəxi haman mətləbi təkrar edib deyirik ki, kəndlərimiz müəllimsiz və mürəbbisiz qalıbdır.* F.Köçərli. *Qurd-quş dəxi girmiş aşiyanə; Çökmüş də həzin sükut cəhanə.* A.Şaiq.

2. Daha, artıq. *Elə ki taxıldı burnuma çeşmək; Qocalıq əl verib, dəxi nə etmək..* M.V.Vidadi. *Eylə bilirdim ki, dəxi sübh olub; Mürği-səhər tək bir ağız banladım.* M.Ə.Sabir. *Dəxi bundan artıq .. gücüm heç bir şeyə çatmır..* N.Vəzirov.

**DƏXİL** *is.* [*ər.*] *köhn.* Sığınan, himayə axtaran, kömək istəyən. ◻ **Dəxil düşmək** (bəzən "qapına", "qapısına" sözü ilə) – sığınmaq, himayə istəmək, kömək istəmək. [Azarlılar:] *Hacı əmi! Qapına dəxil düşmüşük, şeyx cənablarından bizə bir çarə.* C.Məmmədquluzadə. *Şübhəsizdir ki, ona ləqəbi sərdar Rəşidin dəxil düşməsi ilə Hacı Səməd xan vermişdi.* M.S.Ordubadi. **Dəxil olmaq** – b a x **dəxil düşmək**. *Dedi: – Oldun xilas düşməndən; Mənə gəldin, dəxil oldun sən.* S.Ə.Şirvani.

**DƏXL** [*ər.*] Əlaqə, münasibət, aidiyyət (adətən "dəxli" şəklində). *Uşaq mənimdir, baba! Dəxli nədir sizlərə? Kim sizi qəyyum edib, hökm edəsiz bizlərə?* M.Ə.Sabir. *Naşad əfəndi heç də mətləbə dəxli olmayan lüzumsuz sözlərlə* [Mehribanın] *canını sıxırdı.* S.Hüseyn. *Musa dayının qayıtması və ya qalmasının baş küçədən gələn səslərə nə dəxli var?* Mir Cəlal.

**DƏKKƏ** *is. məh.* İri heyvanların (inək, öküz və s.-nin) aşığı; maça. *Dəkkə ilə aşıq-aşıq oynamaq.*

**DƏQİQ** *sif.* [*ər*] 1. Düpdüz, tamamilə düzgün, incədən-incəyə düzgün. *Dəqiq cihazlar. Dəqiq tərəzi. Sənin qüdrətini, sənin əzmini; Dəqiq maşınlarla hesabladılar.* B.Vahabzadə. // Nöqtəsi-nöqtəsinə, incədən-incəyə düzgün. *Dəqiq tərcümə. Dəqiq elmi əsaslara görə.* ◻ **Dəqiq elmlər** – riyaziyyata əsaslanan elmlər.

2. İşində son dərəcə səliqəli, diqqətli, düzgün olan. *Dəqiq adam.*

**DƏQİQƏ** *is.* [*ər*] 1. Bir saatın altmışda birinə bərabər və ya 60 saniyədən ibarət olan vaxt ölçüsü. *Bir dəqiqə sükutdan sonra vəzir Mirzə Möhsün başladı danışmağa.* M.F.Axundzadə. *Gün var ki, dəqiqəsi uzun əsrə bərabər; Çeşmə kimi baş alır bu gündən qərinələr.* R.Rza.

2. Az, lakin qeyri-müəyyən vaxt, an. ◻ **Bir dəqiqədə** – dərhal, o saat. *Bir dəqiqədə arvad-uşaq gəlinin başına toplandılar.* Çəmənzəminli. **Bu dəqiqə** – indicə, dərhal. [Aydəmir:] *...Ölümümü istəsən, bu dəqiqə ölərəm.* C.Cabbarlı. **O dəqiqə** – o saat, dərhal. *Elə bu vaxt zəng vurulur; O dəqiqə qaçır Reyhan.* M.Dilbazi. // Vaxtın müəyyən anı (bəzən cəm şəklində). [Cəmilə] *ciddi bir mövqedə bulunur, həyatının mühüm dəqiqələrini yaşayırdı.* S.Hüseyn. [Cavadın] *diş göynədən sulardan az-az, tez-tez içdiyi dəqiqələr gözləri qabağında canlandı.* Ə.Vəliyev.

3. Çevrənin $^1/_{60}$-nə bərabər olub, yazıda rəqəmin üstünə (′) işarəsi qoyulmaqla göstərilən dərəcə ölçüsü.

**dəqiqə-dəqiqə** *zərf* Dəqiqədə bir, arabir, çox qısa müddətdə. *Ancaq quduz xəzri dəqiqə-dəqiqə ara verib damlar başında uluyurdu.* S.M.Qənizadə.

**DƏQİQƏBAŞI** *zərf* Hər dəqiqədə, hər dəqiqədən bir, tez-tez, müttəsil. *Dəqiqəbaşı su içmək. – Yunis dəqiqəbaşı vaqonun qapısına çıxır, pəncərəsindən boylanıb cənuba doğru baxırdı.* Mir Cəlal.

**DƏQİQƏBƏDƏQİQƏ** *zərf* Hər dəqiqə, getdikcə; arası kəsilmədən. *Kombayn dəqiqəbədəqiqə halı yaxşılaşan xəstəyə bənzəyirdi.* S.Rəhman.

**DƏQİQƏLİK** *sif.* Dəqiqə müddətində olan (adətən saylarla). *Bir dəqiqəlik iş. İki dəqiqəlik sükut. On dəqiqəlik tənəffüs.* – [Hüsaməddin:] *Sənsən beş dəqiqəlik nəşələrin nəticəsində insanları əbədi fəlakətə düşürən, həyatın sonuna qədər inlədən.* M.S.Ordubadi.

**DƏQİQƏŞÜMAR** *sif.* [*ər.* dəqiqə və *fars.* ...şümar] *köhn.* Saatda dəqiqəni göstərən böyük əqrəb. *Divar saatının dəqiqəşümarı.*

**DƏQİQLƏŞDİRİCİ** *sif.* Dəqiq hala gətirən, tam aydınlaşdırıcı, dəqiq göstərən. *Dəqiqləşdirici alət.*

**DƏQİQLƏŞDİRİLMƏ** "Dəqiqləşdirilmək"dən *f.is.*

**DƏQİQLƏŞDİRİLMƏK** *məch.* Dəqiq hala salınmaq, tam düzgün hala salınmaq, dürüstləşdirilmək, qəti müəyyənləşdirilmək.

**DƏQİQLƏŞDİRMƏ** "Dəqiqləşdirmək"-dən *f.is.*

**DƏQİQLƏŞDİRMƏK** *f.* Dəqiq hala salmaq, tam düzgün hala gətirmək, dürüstləşdirmək, qəti müəyyənləşdirmək. *Məlumatı dəqiqləşdirmək. Rəqəmləri dəqiqləşdirmək. Mövzunun adını dəqiqləşdirmək. – Orxan nə illah elədi, Bakıdan ayrıldığı günlərin sayını dəqiqləşdirə bilmədi.* İ.Məlikzadə.

**DƏQİQLƏŞMƏ** "Dəqiqləşmək"dən *f.is.*

**DƏQİQLƏŞMƏK** *f.* Dəqiq hala gəlmək, tam düzgün şəkil almaq, dürüstləşmək, düzgünləşmək, qəti müəyyənləşmək. *Ölçü prosesi dəqiqləşdikcə, tam ədədlər artıq kifayət etmir.* Z.Xəlilov.

**DƏQİQLİK** *is.* Dəqiq şeyin halı; tam düzgünlük, mükəmməllik, həqiqətə tam uyğunluq. *Tərcümənin dəqiqliyi. Ölçünün dəqiqliyi. Cihazın dəqiqliyi. İfadənin dəqiqliyi.*

**DƏQİQŞÜNAS** *sif.* və *is.* [*ər.* dəqiq və *fars.* ...şünas] İncədən-incəni başa düşən (adam).

**DƏQQÜLBAB** [*ər.*]: **dəqqülbab etmək (eləmək)** – qapını döymək, taqqıldatmaq. [Xudayar bəy] *qəndi vurdu qoltuğuna, bir öskürüb* [qapını] *dəqqülbab elədi.* C.Məmmədquluzadə. *Az vaxtdan sonra eşitdi ki, qapını dəqqülbab edirlər, bildi ki, Rüstəmdir.* Ə.Haqverdiyev.

**DƏLALƏT** *is.* [*ər.*] 1. Dəlil, sübut. □ **Dəlalət etmək (eləmək)** – sübut etmək, göstərmək, təsdiq etmək. [Hakimi-şər:] *Siz məni inandırırsınız ki, Ağa Mərdan dindar adamdır? Bu dəlalət edir sizin nadürüstlüyünüzə.* M.F.Axundzadə. [Məşədi İbad:] *...Bir də mən sənə deyim, insanın başının ağlığı onun qocalığına dəlalət eləməz.* Ü.Hacıbəyov.

2. *klas.* Yol göstərmə, rəhbərlik. *Mən əqldən istərəm dəlalət; Əqlim mənə göstərər zəlalət.* Füzuli. □ **Dəlalət etmək** (**eləmək** və s.) *köhn.* – 1) yol göstərmək, rəhbər olmaq, sövq etmək, yönəltmək. [İsa:] *..Dəlalət buyur bizi bir əmələ ki, o əməl bizi cənnətə daxil eləsin.* C.Məmmədquluzadə; 2) çağırmaq, dəvət etmək. *Könlümün nöqtəsin götür qaradan; Doğru yola məni dəlalət eylə.* Aşıq Ələsgər.

**DƏLBƏND** *is. köhn.* Dəvənin boynundan keçib palanın arxasında düyünlənən örkən. *Dəlbəndi bərk bağlamaq.*

**DƏLDİRİLMƏ** "Dəldirilmək"dən *f.is.*

**DƏLDİRİLMƏK** *məch.* Deşdirilmək, deşik açdırılmaq.

**DƏLDİRMƏ** "Dəldirmək"dən *f.is.*

**DƏLDİRMƏK** *icb.* Deşdirmək, deşik açdırmaq.

**DƏLƏ** *is.* 1. *zool.* Yırtıcılar dəstəsindən xəzdərili məməli kiçik heyvan. *Dələ dərisi.*

2. Həmin heyvanın dərisi, xəzi. *Boynu dələdən olan palto.*

**DƏLƏDUZ** *is.* Fırıldaqçı, adamaldadan, hiyləgər, bic. *Mənim qızım Səfərdən yaxşı oğlana getməyəcək ki, oğru deyil, dələduz deyil, bir kəsin toyuğuna daş atmaz.* Ə.Haqverdiyev. *Bəlkə, deyirdim, kağızı bir dələduza oxutmuşdur, arvadı dolayıb qızışdırmışdır.* Mir Cəlal. // Sif. mənasında. [Şamama Cadu:] *Amma dələduz nökərlə arası yoxdur.* Ə.Haqverdiyev. *Biz o cür dələduz adamların gərək tamam nəslini də yer üzündən kəsək.* M.S.Ordubadi. // Söyüş mənasında. [İsmayıl bəy:] *O elə bir dələduzdur ki, yer üzündə bərabəri yox.* N.Vəzirov. *Yaxşı, ay dələduz! Bir danış görək; Neçəyə satmısan yox vicdanını?* S.Vurğun.

**DƏLƏDUZCASINA** *sif.* və *zərf* Dələduz kimi, dələduza xas olan bir qaydada.

**DƏLƏDUZLUQ** is. Fırıldaqçılıq, hiyləgərlik, biclik. *Dələduzluq etmək. – Mən Mirzənin də dələduzluğunu görmüşəm.* S.Rəhimov.

**DƏLƏGEY** *sif. dan.* 1. Səliqəsiz, tör-töküntülü, pinti. *Dələgey qız.*

2. Evində oturmayıb, ora-bura qaçıb söhbət etməyi sevən. *Dələgey arvad.*

**DƏLƏGEYLİK** *is. dan.* Səliqəsizlik, pintilik.

**DƏLƏQARIN** *sif.* və is. *dan.* Doymaz, çoxyeyən, qarınqulu (adam).

**DƏLƏQARINLIQ** *is. dan.* Qarınqulu

luq.

**DƏLƏMƏ** *is.* Pendir halına keçmək üzrə olan süd, pendir üçün mayalanmış süd. *Qoyun sürüləri nə çox görünür; Bir dələmə tapıb içsək, pis olmaz.* S.Vurğun. *Gahi pendir suyudur, gahi qatıq, gah dələmə; Kim ki, tənqidinə layiqdir, onu al qələmə.* Ə.Vahid.

◊ **Dələmə kimi** – ağ və yumşaq (koppuş). *Dələmə kimi uşaq.*

**DƏLƏMƏLƏNDİRİLMƏ** "Dələməlǝndirilmək"dən *f.is.*

**DƏLƏMƏLƏNDİRİLMƏK** *məch.* Dələmə halına salınmaq (südü).

**DƏLƏMƏLƏNDİRMƏ** "Dələmələndirmək"dən *f.is.*

**DƏLƏMƏLƏNDİRMƏK** *f.* Dələmə halına gətirmək (südü).

**DƏLƏMƏLƏNMƏ** "Dələmələnmək"dən *f.is.*

**DƏLƏMƏLƏNMƏK** *f.* Dələmə olmaq, dələmə halına gəlmək (süd).

**DƏLƏNÇİK** *is. məh.* Oxlov.

**DƏLƏNGAVAZ** *sif. dan.* Həddindən artıq uzun, irisümüklü, biçimsiz, nahamar. *Dələngavaz adam.*

**DƏLƏYƏN** bax **ağacdələn**. ..*Uşaqlıqda ağaclara dırmaşıb dələyən balaları çıxardığı irigövdəli palıd ağaclarının dövrəsində dolanacaqdır.* S.Rəhimov.

**DƏLİ** 1. *sif.* Ağlı və şüuru yerində olmayan, ruhi xəstə; divanə. *Dəli arvad.* // İs. mənasında. *Dəlilərə məxsus xəstəxana. – Dedim: – Bir nəzər qıl, aşiq, halına; Dedi: – Əcəb dəli, divanədir bu!* Qurbani. ☐ **Dəli etmək (eləmək, qılmaq)** – 1) ağlını başından almaq, ağıl və şüurunu itirməsinə səbəb olmaq, divanə etmək. *Hüsnün dəli qıldı mehrü mahı.* Nəsimi. *Qurbani der: bəsdir məni puç etdin; Aldın əqlim əldən, dəli, gic etdin.* Qurbani; 2) *məc.* hirsləndirmək, cinləndirmək, coşdurmaq, özündən çıxartmaq. **Dəli olmaq** – 1) ağıl və şüurunu itirmək. *Oğlunun yerini demədiyinə görə döyülmüş bu ananı dəli olduğu üçün həbsxanadan buraxmışdılar.* Ə.Abasov; 2) *məc.* özündən çıxmaq, qızmaq, hirslənmək, bərk əsəbiləşmək, coşmaq, azğınlaşmaq. *Teymur kağıza baxan kimi dəli olur.* "M.N.lətif.".

2. *is.* Gic, axmaq, sarsaq, ağılsız, öz danışığını və hərəkətini bilməyən adam. [Səfər:] *Mənə dəli deyirlər, amma məndən dəliləri çoxdur.* C.Cabbarlı. [Xudayar bəy:] ..*O arvad o qədər dəlidir ki, o qədər huşsuzdur ki, qorxuram ki, lap dana.* C.Məmmədquluzadə.

3. *sif. məc.* Azğın, coşqun, hiddətli, şiddətli, önüalınmaz. *Dəli külək əsir. – Dəryada da qorxunc, dəli bir fırtına vardı.* S.Vurğun. *Dəli dalğaların döş gərə-gərə; Kükrəyib sıçrayır uca göylərə.* R.Rza.

4. *is. məc.* **"Dəlisi"** şəklində – bir şeyin düşkünü, mübtəlası, bir şeyə həddindən artıq məhəbbət və həvəs göstərən adam, bir şeyin aludəsi; vurğun. *Kitab dəlisi. Teatr dəlisi. Futbol dəlisi. – Kimdir mənim kimi ellər dəlisi? Hər kimsənin öz boynunda karı var..* Q.Zakir.

5. *sif. məc.* Folklorda: dəlicəsinə qoçaq, igid, qəhrəman. *Dəli Kərəm. Dəli Alı. – Dəli Həsən bir Koroğluya baxdı, bir dönüb .. adamlarına baxdı, hündürdən bir şaqqa çəkib güldü.* "Koroğlu". // İs. mənasında (adətən cəm şəklində). *Koroğlunun dəliləri. – Dəlilər çaxnaşıb bir-birinə dəydilər.* "Koroğlu".

6. *sif. məc.* Ürkək, oynaq. *Düşdü yenə dəli könül gözlərinin xəyalinə.* Nəsimi. *Ey ağalar, bir nigarın oduna; Dəli könül yana-yana düşübdür.* M.V.Vidadi.

◊ **Dəli şeytan deyir...** – bir işi görməkdə tərəddüd bildirir.

**dəli...** Bəzi mürəkkəb (adətən yabanı) bitki adlarının birinci tərkib hissəsi; məs.: dəlibəng, dəliböyürtkən.

**DƏLİBAŞ** *sif.* Dəlisov, dəlitəhər, azğın, qudurğan. *Dəlibaş gənc. – Bu xəbər hamını bərk qorxuya salmışdı, çünki Səfər dəlibaş bir adam idi.* S.S.Axundov. // Dəliqanlı. [Güləndam:] *Heydərqulu, Ağa bir dəlibaş uşaqdır.* N.Vəzirov.

**DƏLİBAŞLIQ** *is.* Dəlisovluq, qudurğanlıq, azğınlıq. *Dəlibaşlıq etmək.* // Dəliqanlılıq.

**DƏLİBƏNG** *is. bot.* Yarpaqlarından narkotik maddə hasil edilən birillik bitki; batbat. *Dəlibəng – bir və ya ikiillik bitkidir, .. çirkli-sarı rəngli, geniş qıf şəklində və beşdişli çiçək taclarının üzəri tünd-bənövşəyi rəngli damarla örtülmüşdür.* R.Əliyev.

**DƏLİBÖYÜRTKƏN** *is. bot.* Moruğa bənzər tünd-qırmızı meyvəsi olan kol və onun meyvəsi.

**DƏLİCƏ** 1. *sif.* Dəli kimi, dəlisoy. *Dəlicə hərəkət.*

2. *zərf, məc.* Çox bərk, son dərəcə, hədsiz, dəlicəsinə. *Dəlicə sevmək.*

3. *zool.* Qoyun beynində əmələ gələn qurd.

**DƏLİCƏSİNƏ** *zərf* 1. Dəli kimi, dəlilərə xas olan bir surətdə, özünü itirmiş halda. *Dəlicəsinə hərəkət. Dəlicəsinə danışmaq. – Rəsul dəlicəsinə ayılıb gördü ki, qəbiristanlıqdadır.* "Aşıq Qərib". [Ayna:] *Yoxsa sən mənim uşaqlarımı əlimdən alıb ərimə də göz dikirsən? – deyə dəlicəsinə qışqırırdı.* S.Rəhimov.

2. *məc*. Hədsiz, coşqun bir surətdə, ehtirasla, son dərəcə. *Mənim quş balasına olan məhəbbətimi oxuculara qələm ilə anlada bilməyəcəyəm. Bu kiçik məsum heyvanları dəlicəsinə sevirdim.* A.Şaiq.

**DƏLİCİ** *is.* Dələn (deşən) alət, deşici alət. *Dəlmə işləri elektrik dəliciləri vasitəsilə aparılır.* // *Sif.* mənasında. *Dəlici alət.*

**DƏLİ-DİVANƏ** b a x **dəli** 1 və 4-cü mənalarda. *Bu uçan pərvanədir; Qəlbi şanəşanədir; Mən xəbərsiz gəlmişəm; Yar dəli-divanədir.* (Bayatı). *Bən bir dəli-divanəyəm, gör kim, nə məmur olmuşam.* Nəsimi. [1-ci əcinnə:] *Budur, neçə vaxtdır xanım bunu gözləyir. Bundan ötrü dəli-divanədir.* Ə.Haqverdiyev. ◻ **Dəli-divanə etmək** – b a x **dəli etmək** (**"dəli"**də). [Güldəstə:] [Hacını] *dəli-divanə edən sənin dövlətindir.* N.Vəzirov. **Dəli-divanə olmaq** – b a x **dəli olmaq** (**"dəli"**də). *Şahsənəm günü o gündən Qərib deyə dəli-divanə olmuşdu.* "Aşıq Qərib". *..Dövlət duması barəsində yazdıqlarınızı oxuyub, inan ki, dəli-divanə oluram.* Ü.Hacıbəyov.

**DƏLİ-DOLU** *sif. dan.* İntizamsız, danışığını, hərəkətini bilməyən. *Dəli-dolu adam.* // Dəlibaş. *Hirsli, dəli-dolu bir gəncə bənzər; Atalar demişkən, acıqlı mərddir.* S.Vurğun.

**DƏLİGİLAS** *is. bot.* Dağlarda bitən və yeyilməyən acı meyvəsi olan yabanı gilas.

**DƏLİXANA** *is.* 1. Ruhi xəstələri, dəliləri saxlamaq və müalicə etmək üçün xəstəxana. *A kişi, bu məlun oğlu* [Molla Abbas] *genə buradadır? Bəs bunları aparacaq idilər dəlixanaya?* C.Məmmədquluzadə.

2. *məc*. Çox hay-küy olan, səsdən başqulaq tutulan yer haqqında. *Bura lap dəlixanadır.*

**DƏLİXƏK** *sif.* və *is. dan.* 1. Dəli xasiyyətləri göstərən. *Onun sözlərinə çox bənd olma, dəlixək adamdır.*

2. Gülməli hərəkətlər göstərən və gülməli sözlər danışan adam; təlxək.

**DƏLİXƏKLİK** *is.* Güldürücülük; təlxəklik.

**DƏLİK** b a x **deşik**. *Dəlik açmaq.* – [Molla Xəlil] *bir dəlik axtarırdı ki, içərideki qadının kim olduğunu görüb tanısın.* S.Hüseyn.

**dəlik-dəlik** *sif.* Deşik-deşik, çox deşikli. *Dəlik-dəlik taxta.* ◻ **Dəlik-dəlik etmək** – deşik-deşik etmək. *Naxçıvanda naçalnik .. müsəlmanların qarnını yumruq ilə dəlik-dəlik eləyib.* C.Məmmədquluzadə. **Dəlik-dəlik olmaq** – deşik-deşik olmaq. *Dəlik-dəlik oldu sinəm sərasər; Qəmzə oxun mənə az at, sevdiyim!* M.P.Vaqif.

**DƏLİKÇİÇƏK** *is. bot.* Novruzçiçəyi fəsiləsindən olan bir, iki, bəzən çoxillik ot bitkisi.

**DƏLİK-DEŞİK** 1. *sif.* Çox deşikli, deşik-deşik. *Dəlik-deşik bayraqların rəngi qana boyanmışdır.* S.Vurğun.

2. *top*. Dəliklər, deşiklər. *Dəlik-deşiyini tutmaq.* – [Heydər bəy:] *Əgər yüz min zəhmətlə birisini dağların dəlik-deşiyindən çıxartsan, bir dağarcıq, bir kürkdən başqa əlinə bir zad düşməyəcək.* M.F.Axundzadə.

**DƏLİK-DEŞİKLİ** *sif.* Dəlik-deşikləri çox olan, başdan-başa deşik olan. *Dəlik-deşikli damdan yağış damır.*

**DƏLİKLİ** *sif.* Dəliyi olan; deşikli. *Dəlikli sərnic. Dəlikli dolça.*

◊ **Dəlikli sümük** *anat*. – qılça ilə birləşən sümük.

**DƏLİQANLI** 1. *is.* Həddi-büluğa çatmış gənc, cavan oğlan. *..Səfərin Sibirdən qaçıb, başına özü kimi dəliqanlıları cəm edərək quldurluq etməyi hər yerə yayılmışdır.* S.S.Axundov. *Bu adamın hərəkətindən və simasından gəncliyində çox igid və kefcil bir dəliqanlı olduğu anlaşılırdı.* A.Şaiq. *Gəlinlər, qızlar, kəndin dəliqanlıları əl-ələ tutuşub yallı getdilər..* M.Hüseyn.

2. *sif.* İgid, cəsur, qoçaq. *İrəliyə doğru şığıyan dəliqanlı Girdman hökmdarı Varazın oğlu Cavanşir idi.* M.Hüseyn. // Coşqun, tezqızışan, qızğın, qudurğan, dəlibaş. *Ruqiyyədən çəkinməsə idilər, dəliqanlı oğlanlar məni tikə-tikə edərdilər.* A.Divanbəyoğlu.

**DƏLİQANLILIQ** *is.* 1. Həddi-büluğa çatmış gəncin hal və keyfiyyəti.

2. İgidlik, cəsurluq, cəsarət. // Qızğınlıq, coşqunluq.

**DƏLİ-QUDURMUŞ** *is.* Azğın, qudurğan (adam). [Tükəz:] *Görəsən, gənə hansı dəli-qudurmuşa rast gəldi, tovlayıb at, mal oğurluğuna götürüb getdi.* M.F.Axundzadə. *Nemət çiynində beşaçılan olduğu halda, bir neçə özü kimi dəli-qudurmuşlarla kəndin içində gəzirdi.* S.Hüseyn.

**DƏLİL** *is.* [*ər.*] Hər hansı bir şeyi sübut etmək üçün əsas; sübut. *Tutarlı dəlil. Dəlil gətirmək. Bunu sübut etmək üçün dəlil lazımdır.* – [Hacı Kərim:] *İksirin aləmdə vücudu olmağına dəlil çoxdur!* M.F.Axundzadə. *Müəllim hiss etdi ki, belə mühüm bir məsələni Telli kimi avam bir qadına qandırmaq üçün əsaslı dəlillər və sübutlar lazım gələcəkdir.* S.Hüseyn. *Məmməd bəyin dəlilləri Rəşid bəyi xeyli düşündürdü.* M.Hüseyn.

◊ **Dəlil etmək** – yol göstərmək, nəsihət etmək (bəzən "nəsihət", "dəlalət" sözləri ilə birlikdə işlənir). *Xəyalımda qoymuşdum; dəlil-nəsihət etməklə Məşədini yola gətirəm.* C.Məmmədquluzadə. *Sadıq şirin dilini işə saldı. Kərimə göz vurdu. Xanpəriyə dəlil-dəlalət elədi.* Ə.Vəliyev.

**DƏLİLƏŞMƏ** "Dəliləşmək"dən *f.is.*

**DƏLİLƏŞMƏK** *f.* Dəli olmaq, dəli halına gəlmək, özündən çıxmaq, azğınlaşmaq, dəli kimi hərəkət etmək. *Onun acığı tutanda dəliləşir.*

**DƏLİLİK** *is.* 1. Ağlı başından çıxmış adamın halı. *Dəlilik əlamətləri.*

2. *məc*. Ağılsız iş və hərəkət, ağılsız söz; tərslik. □ **Dəlilik etmək** – ağılsız iş görmək, mənasız hərəkət etmək; tərslik etmək. [Səlim:] *Qızım, dəlilik etmə! Ayın beş gün qaranlığı olanda, beş gün də işığı olar.* C.Cabbarlı. **Dəliliyi tutmaq** – tərslik etmək, tərsliyə başlamaq.

**DƏLİLLƏŞDİRİLMƏ** "Dəlilləşdirilmək"-dən *f.is.*

**DƏLİLLƏŞDİRİLMƏK** *məch.* Dəlillərlə əsaslandırılmaq.

**DƏLİLLƏŞDİRMƏ** "Dəlilləşdirmək"dən *f.is.*

**DƏLİLLƏŞDİRMƏK** *f.* Dəlillərlə əsaslandırmaq.

**DƏLİLLƏŞMƏ** "Dəlilləşmək"dən *f.is.*

**DƏLİLLƏŞMƏK** *f.* Dəlillərlə əsaslanmaq.

**DƏLİLLİ** *sif.* Dəlili olan; sübutlu, əsaslı.

**DƏLİLSİZ** *sif.* Dəlili olmayan; sübutsuz, əsassız. *Dəlilsiz fikir sübuta yetməz.*

**DƏLİLSİZLİK** *is.* Dəlil, sübut olmaması; sübutsuzluq, əsassızlıq.

**DƏLİNMƏ** "Dəlinmək"dən *f.is.*

**DƏLİNMƏK** *f.* Deşilmək. *..Bir çuval ki köhnəldi, o tərəfdən-bu tərəfdən hey başlayacaq yırtılmağa və dəlinməyə.* "Mol. Nəsr." // Qazılmaq. *Yerlərin bağrı dəlinir; Əcəb tunellər vurulur.* Aşıq Əli.

**DƏLİSOV** *sif.* Dəli kimi; nə dəli, nə də ağıllı. *Dəlisov adam.* // Qızğın, heç bir şeydən çəkinməyən, qorxmayan, cəsarətdə ifrata varan. *Siz mənim bir az sərt, bir az ərköyün; Bir az da dəlisov övladlarımsız.* M.Araz.

**DƏLİSOVLUQ** *is.* Dəlisov adamın halı. // Dəli hərəkətinə oxşayan hərəkət. *Mirsalehin dəlisovluq etməsi; .. İndi desək, əhvalatdı, nağıldı..* Şəhriyar.

**DƏLİSOY** b a x **dəlisov**. *Mənim də onun kimi dəlisoy anlarım var; Vaxt olur ki, pozuram şerimin ahəngini.* S.Rüstəm.

**DƏLİSOYLUQ** b a x **dəlisovluq**.

**DƏLİTƏHƏR** b a x **dəlisov**.

**DƏLİTƏRƏ** *is. bot.* İkişər ləlәkvari yarpaqları olan xaşxaş fəsiləsindən birillik ot bitkisi.

**DƏLLAL** *is.* [*ər.*] 1. Alverdə alanla satan arasında vasitəçilik edən şəxs. *Genə şəhr içrə gördü ol minval; Satır əvvəlki eşşəyi dəllal.* S.Ə.Şirvani. *Dəllallar ilə hiylədə şeytan da bacarmaz! Şeytan nəçidir, cin nədi, xortdan da bacarmaz!* Ə.Vahid.

2. Hər hansı bir işi həll etmək üçün iki nəfər arasında vasitəçilik edən adam; araçı. *Əhməd orta məktəbi bitirdiyi gündən Məhərrəm əmi onun pulsuz dəllalı olmuşdu.* A.Şaiq.

3. Aradüzəldən, vasitəçi. *O bilirdi ki, bu qadın dəllalları fəlakətə düşmüş qurbanlarını dərhal görür.* M.İbrahimov.

**DƏLLALBAŞI** *is. köhn.* Dəllalların böyüyü, başçısı. [Ağa Kərim:] *..Əziz bəy, məlum ola ki, mənə Ağa Kərim dəllalbaşı deyirlər.* M.F.Axundzadə.

**DƏLLALHAQQI** *köhn.* b a x **dəllallıq** 2-ci mənada.

**DƏLLALLIQ** *is.* 1. Dəllallın işi, peşəsi; alverdə alanla satan arasında vasitəçilik. *Muxtalə dəllallıq edən bir qadındır.* M.S.Ordubadi. [İsmayıl:] *Kərbəlayı Xəlil at dəllallığı eləyir, evi də Əmirxizdədir.* P.Makulu.

2. Dəllalın vasitəçilik üçün aldığı haqq; dəllalhaqqı. *Dəllallıq istəmək. Dəllallıq vermək. Dəllallıq haqqı. – Fəqət Xudayar xanın əmlakından qalxan tamam məhsulat mənim əlimlə satılır və bu satışın dəllallıq haqqı ildə neçə yüz min tümən edir.* Ə.Haqverdiyev.

**DƏLLƏK** is. [*ər.*] 1. Baş və üz qırxmaq peşəsi ilə məşğul olan adam; bərbər. *Bəli, başlar başlayıblar qırxılmağa. Dəllək dükanlarında macal yoxdur.* C.Məmmədquluzadə.

2. Köhnə məişətdə: baş və üz qırxmaqla yanaşı, qan almaq kimi ara həkimliyi işləri ilə də məşğul olan adam. *Qətibə Atabəyin yatağının yanını kəsib oturmuşdu. Dəllək gəlib qan götürdü.* M.S.Ordubadi.

3. Hamamda kisəçəkən və masaj edən adam; kisəçi.

4. *məc.* Haqverməz, haqkəsən, fırıldaqçı, başqasını aldadıb pulunu, şeyini əlindən alan adam haqqında. *..Adları bəy, özləri cibkəsənlər, dəlləklər, quldurlar...* N.Vəzirov. *Siz elə bilməyin ki, dəllək N. üzqırxan dəlləkdir, xeyr, o, cibqırxan dəlləkdir.* "Kirpi".

◊ **Dəllək kimi baş qırxmaq** – aldatmaq, aldadıb əlindəkiləri almaq, aldadaraq vardövlətini ələ keçirmək. *Dağılıb çöllərə açdı hərə bir növ kələk; Qırxdı xalqın başını hər biri misli-dəllək.* S.Ə.Şirvani.

**DƏLLƏKXANA** *is.* [*ər.* dəllak və *fars.* ...xanə] Dəllək dükanı; bərbərxana. *Səməd, doğrudan da o gedən gedib, bir daha dəlləkxanaya üz çevirmədi.* M.Hüseyn.

**DƏLLƏKLİK** *is.* 1. Dəllək (1, 2 və 3-cü mənalarda) peşəsi, işi; bərbərlik. *Dəlləkliyi bizim başımızda öyrənir.* (Ata. sözü).

2. *məc.* Hiyləgərlik, haqqı danma.

**DƏLMƏ** 1. "Dəlmək"dən *f.is. Dəlmə aləti.*

2. *is.* Divarda açılmış kiçik taxça. *İçəridə kahanın divarlarında böyüklü-kiçikli beş dəlmə gözə çarpırdı.* S.Rəhimov.

3. *is.* Bərə, çəpər, hasar və s.-də deşik.

4. *sif.* Dəlinmiş, deşilmiş; dəlinməklə qayrılmış.

**DƏLMƏ-DEŞİK** *top.* Öz-özünə açılmış, yaxud süni surətdə əmələ gətirilmiş irilixırdalı deşiklər. *Dəlmə-deşiyi tutmaq.* // Sif. mənasında. *Dəlmə-deşik divar. Dəlmə-deşik yer.* – [Umud:] *Dədəm axşamlar nahaq təzək yandırır, tay da dəlmə-deşikdəki ağcaqanadları ürküdür, onlar da hirslənib daraşırlar canımıza.* İ.Məlikzadə.

**DƏLMƏGÖZ(LÜ)** b a x **dombalangöz(lü)**.

**DƏLMƏK** *f.* 1. Bir şeylə deşmək, dəlik açmaq, oymaq. *Taxtanı dəlmək. Dəmiri dəlmək. – Ağacdələn öz yuvasını ağac koğuşlarında qayırır. Bunun üçün o, ağacda olan hazır koğuşlardan istifadə edir və ya qurumaqda olan ağacları dələrək, yekə koğuş açır.* // Deşib keçmək, dəlib keçmək. *Güllə torpaq barını dəldi.* – [Atakişi] *lap yaxında, yol üstündə əyləşib odlu miskənə ilə rels dələn bir oğlanı dindirdi.* Mir Cəlal. // Məc. mənada. *Bir qələm əsrlik hicran yaratdı; Bir xalqı yarıya böldü qılınc tək; .. Dəldi sinəsini Azərbaycanın.* B.Vahabzadə. *Ara-sıra günəş işıqları* [buludları] *yarır və iti oxlar kimi göy qübbəsini dəlirdi.* M.İbrahimov.

2. *məc.* Adətən "bağrını", "qəlbini", "canını" sözlərlə – mənən incitmək, ruhən əziyyət vermək. *Yandırdı şövqün canımı; Dəldi fəraqın bağrımı.* Nəsimi. *Başıma mənim bir iş gəlibdir; Eşq atəşi ürəyimi dəlibdir.* Xətayi. *Zalım oğlu onu qoyub nişana; Dəlib ürəyini, boyayıb qana.* Aşıq Ələsgər.

**DƏLMƏKÇƏ** *is. dan.* İki həyət arasında bir adamın keçə biləcəyi dar qapı.

**DƏM¹** *is.* [*fars.*] 1. Qısa vaxt, an, ləhzə. ☐ **Bir dəm** – 1) bir vaxt, bir anlıq. *Xəstənəm, çox dilərəm yanıma bir dəm gələsən; Çəkibən xəncəri, bağrım başını bir dələsən.* M.P.Vaqif; 2) heç, əsla. *Gözəl üzündə bir dəm; Nə dərd görmüşdüm, nə qəm.* S.Vurğun. **Bir dəmdə** – bir anda, bir ləhzədə, dərhal, göz açıb-yumunca. *Dönər rəyimlə bir dəmdə bu çərxi-kəcmədar əlbət.* S.Ə.Şirvani. **Bu dəm(də)** – bu vaxt, bu əsnada. *Hərgah bu dəmdə Nurəddinin nəzəri Əmiraslana düşsəydi, onun gözlərində parlayan odu və üzündə zühur edən acığı görərdi.* S.S.Axun-

dov. *Bu dəmdə havadakı mələkdən bir səs gəldi.* Ə.Haqverdiyev. **O dəm(də)** – o saat, o vaxt, o dəqiqə, dərhal. *Ağaclar tərpədəndə baş çəməndə; Söyüd söylər o dəmdə: – Mən də, mən də.* (Ata. sözü). *Cütçü baba böylə deyib qeyznak; Eylədi ol qırğını ol dəm həlak.* A.Səhhət. *Mən istədim mane olam, amma o dəmdə yadıma saldım ki, bu gün, .. bayram günüdür..* C.Məmmədquluzadə. **Hər dəm** – hər dəqiqə, hər an, hər ləhzə, həmişə, daim. *Quzuya qurd desəm – istəməz quzu; Yazıqlar! Hər dəmdə yazıqdı onlar.* M.Araz. // Ümumiyyətlə, vaxt, çağ, zaman, əyyam, dövr (çox vaxt cəmdə işlənir). *Cavanlıq dəmi. – Yorğun qanadlarım çırpınmaq istər; Gəl keçən dəmləri etməyəlim yad.* M.Müşfiq. *Bu dəmlərdə heç nəyə də əlim çatmasa; Qaysağını qopardıram Araz dərdimin.* M.Araz. ◻ **Dəmi gəlmək** – vaxtı gəlmək, növbəsi yetişmək. *Araza gəmi gəldi; Su daşdı, gəmi gəldi; Yaş tök, ağla, gözlərim; Ayrılıq dəmi gəldi.* (Bayatı).

2. *Ədat mənasında.* Gah, bəzən. *– Ay hacı, dünyadır da, dəm eniş, dəm yoxuş, bilmirsən?* S.Rəhimov.

**DƏM²** *is.* [*fars.*] 1. Od üstündə aramla bişmə, yaxud dəm alma. *Xörək dəmdədir. – Dedim: – Vallah, onu-bunu bilmirəm, bu saat ..* [çay] *dəmdə, şahmat da stol üstdə qurulu.* C.Məmmədquluzadə. ◻ **Dəm almaq (çəkmək)** – 1) qaynar suda qalıb yetişmək, suyu çəkilərək öz buğunda bişmək. *Plov dəm almışdır. – Hər cümə avamın plovu dəm çəkir.* M.Möcüz; 2) od üstündə rəng alaraq ətri çıxmaq və içməyə yararlı hala gəlmək (çay, qəhvə haqqında). **Dəm tökmək** – tərləmək, damcı-damcı tökülmək (dəm çəkmək üçün qazanın ağzına qoyulan qapaqdan). **Dəmə qoymaq** – aramla öz buğunda bişmək, yaxud dəm almaq üçün zəif od üstündə saxlamaq. *Xörəyi dəmə qoymaq. Çayı dəmə qoymaq.* **Dəmini almaq** – dəm almaq üçün qazanın ağzına qoyulmuş qapağı götürüb üzərindəki damcı-damcı suyu kənara tökmək. *Sürmə xala plovun dəmini aldı..* S.Rəhimov.

2. Buğ, buxar, qaz. // Kömürün və s.-nin natamam yanması nəticəsində əmələ gələn boğucu, zəhərli qaz. *Dəm tutmaq. Dəmdən zəhərlənmək. Dəm qazı.*

3. *məc.* Kef, nəşə; istirahət. *Dəm dəm gətirər, qəm – qəm.* (Ata. sözü). *Qüssəyə gəl, qəmə gəl; Kef istəsən, dəmə gəl; Dərd bilən özü gələr; Bilməyənə demə, gəl.* (Bayatı). ◻ **Dəm almaq (çəkmək)** – nəşələnmək, keflənmək, ləzzət çəkmək, xoşlanmaq. [Aşpaz] *ocağın istisi dəydikcə xumarlanıb dəm alırdı.* M.Hüseyn. **Dəmə uymaq** – kefə uymaq, başı kefə qarışmaq. *Heç demirlər oğul-uşaq var. Yaqin dəmə uyublar.* S.Rəhimov. **Dəmi sazlanmaq** – kefi gəlmək; nəşələnmək. *Mocuxun kefi kökəldi, dəmi sazlandı.* S.Rəhimov.

4. *məc. dan.* Bərk kefli, məst. *Hərif dəmdir.*

5. *məh.* B a x **dəmyə** 1-ci mənada. *Dəm xır. Dəm bostan.*

◊ **Dəm tutmaq** – 1) züy tutmaq b a x **züy¹** (1-ci mənada). *Yağan o gur yağış da silə bilmədi fəqət; Onun kədərlərinə dəm tutmuşdu təbiət.* B.Vahabzadə; 2) səsini başqasının səsinə uyğunlaşdırmaq. [Ziba] *özözünə mığıldaya-mığıldaya uşağın ağlamağının dəmini tuturdu.* C.Məmmədquluzadə. *..İmamqulu isə koxanın xorultusuna gecə uzunu dəm tutdu.* S.Rəhimov; 3) *məc.* başqasının dediklərini, fikrini təkrar etmək, başqasının hərəkətlərini təqlid etmək. **Dəm vermək** – 1) hərəkətə gətirmək, işə başlamaq. *İşə dəm vermək*; 2) b a x **dəm tutmaq** 2 və 3-cü mənalarda. **Dəm vurmaq** – səlahiyyəti, məlumatı, xəbəri və ya haqqı olmadığı bir şeydən ağızdolusu danışmaq, bəhs etmək, iddiasında olmaq. *Hətta millətin dərisini soyan adamlar da millətdən dəm vurub, "millət belə gəldi, millət belə getdi" deyirlər.* F.Köçərli. // Ümumiyyətlə, bir şey haqqında danışmaq. *Füzuli, aləmi-qeyd içrəsən, dəm vurma eşqindən.* Füzuli. *Göyün ulduzları da guya bir-biri ilə məhəbbətdən dəm vururdular.* Ə.Haqverdiyev. [Bədircahan:] *Birdən başlarsan cahıllıqdan dəm vurmağa, onda yəqin ki, iş düzəlməz.* N.Vəzirov. // "Özündən" sözü ilə – özünü tərifləmək. *Az özündən dəm vur. – Çox özündən dəm vuran aşıqların sazını əlindən alıb yola salmışdı.* "Koroğlu". **Dəmə tutmaq** – danışdırmaq, sorğu-suala tutmaq. *Qubernat tutubdur Sonanı dəmə; Edir sözlərini dilmanc tərcümə.* H.K.Sanılı.

**DƏM³** *is.* [*fars.*] Nəfəs. ◻ **Dəm-dəmə vermək** – nəfəs-nəfəsə vermək, səs-səsə vermək. *Mərsiyəxanlar verəcək dəm-dəmə; Sən hələ bildiklərini qoy nəmə!* Ə.Nəzmi.

**DƏMADƏM** [*fars.*] *klas.* bax **dəmbədəm**. *Oxu köysümdən ötüb, qalmış imiş peykanı; Ah, bildim səbəbi-ahi-dəmadəm nə imiş.* Füzuli. *Odlu dağimdən dəmadəm pənbeyi-mərhəm yanar; Ah, əgər bən böylə yansam, sərbəsər aləm yanar.* Qövsi.

**DƏMAĞAC** *is.* Araba dayananda boyunduruğun altına qoyulan ağac.

**DƏMBƏDƏM** *zərf* [*fars.*] Saatbasaat, anbaan; hər ləhzə, hər dəqiqə, hər vaxt, daim; getdikcə. *Dəmbədəm nalə qılıb hiç həvadən düşməz; Ney təki sineyi-üşşaq nəvadan düşməz.* S.Ə.Şirvani. *Getdi o qiymətlicə saatlərim; Dəmbədəm artır daha zəhmətlərim.* A.Səhhət. *Onlar .. gün-gündən cəhalət dəryasına qərq olmaqdadırlar, .. dəmbədəm, saatbasaat tənəzzül etməkləri müşahidə olunur.* F.Köçərli.

**DƏMBƏR** *is. məh*. Quyruğu belinə qıvrılan it.

**DƏMBƏRƏ** *is. məh*. Qurumuş torpaq parçası; kəsək.

**DƏMBƏRƏGÖZ** bax **dəbərəgöz**.

**DƏMÇİ** bax **dəmtutan** 1-ci mənada. *Abış .. sümsünü dəsmalla silib yerinə taxdı, Mürşüdə və dəmçi Tosuya dedi: – Başlayaq!* Ə.Abasov.

**DƏMÇİLİK** *is.* Züyçülük, züytutma.

**DƏMDƏMƏKİ** *sif.* Öz hərəkətində, sözündə, fikrində sabit olmayan, tez-tez fikrini, rəyini dəyişən, sözündə məsuliyyət hiss etməyən. *Dəmdəməki adamın sözünə etibar etmək olmaz.* // Yüngül, qeyri-ciddi, boş-boş danışan. // İs. mənasında. *Dəmdəməkinin biridir.*

**DƏMDƏMƏKİLİK** *is.* Öz hərəkətində, işində, sözündə, fikrində sabit olmama, tez-tez fikrini, rəyini dəyişmə. // Yüngüllük, qeyri-ciddilik.

**DƏM-DƏSGAH** *is.* 1. Təntənə, büsat, böyük qonaqlıq, məclis və s. [Qələndər:] *Bunu, bu dəm-dəsgahı ki başlayırıq ha, mən yatsam, yuxumda da görə bilməzdim.* Mir Cəlal. *Tələbə adam hansı otaqda dəm-dəsgah düzəldib oğluna belə ad qoya bilərdi?* S.Rəhimov.

2. Bir iş görmək üçün düzəldilən qurğular və lazım olan başqa şeylər. *Bu dəm-dəsgah nədir?*

**DƏM-DƏSGAHLI** *sif.* Təntənəli, təmtəraqlı, büsatlı. [Toy] *sazandası, xanəndəsi, plovu, içkisi, məzəsi, cehizi, başlığı öz qaydasında dəm-dəsgahlı bir toydu.* Mir Cəlal.

**DƏMƏK** *is.* 1. Heyvanların torpaq altında qazıdıqları yuva. *Tülkü dəməyi. Siçan dəməyi. – Günorta vaxtı siçan öz dəməyində olur, ona binaən ol zaman mallar yeri tapdalamaqdan dəməklərin deşikləri tutulduğuna siçanın nəfəsi darıxıb boğulub tələf olur.* "Əkinçi".

2. *məc*. Kiçik və alçaq ev mənasında; daxma.

**DƏMƏLƏK** *is. bot*. Yemliyəoxşar, südlü və çox acı bir bitki.

**DƏMƏT** *is.* [*ər.*] Çiçək dəstəsi, güldəstə. *Hanı rəngin çiçəklərin, a çəmən? Güllərindən dəmət yapaydım mən.* A.Şaiq. *Əfşan dərindən köksünü ötürdü, əlindəki gül dəməti də xəfifcə titrəyirdi.* M.Hüseyn.

**DƏMGİL** bax **dəngil**.

◊ **Dəmgil xəstəliyi** – bitkilərin gövdə, budaq və yarpaqlarında ləkələr şəklində özünü göstərən xəstəlik. *Dəmgil xəstəliyi bitkinin budaqlarında, gövdəsində, yarpaqlarında və meyvələrində yaşılımtıl-boz, məxməri, yumru şəkilli ləkələr əmələ gətirir.* İ.Axundzadə.

**DƏMGÜZAR** *is.* [*fars.*] *köhn*. Bir yerdə vaxt keçirən; yoldaş. [Markiz:] *Yenə, ey günlər, ey saatlar, siz mənim ilə yoldaş, dəmgüzar olacaqsınız.* N.Nərimanov.

**DƏMXANA** *is.* [*fars.*] *köhn*. Ev, yaşayış yeri. *Axşam oldu, gəldim mən dəmxanama; Sirrimi demədim bacı, anama.* "Aşıq Qərib".

**DƏMİ** bax **demi**. *Əsgər papirosu damağına aldı, qoca dəmisini ona tərəf tutub tüstülətdi.* S.Rəhimov.

**DƏMİN** *zərf* [*türk.*] Bir az əvvəl, indicə, bayaq. *Çəkdi insan kimi o dəm nərə; Fırlayıb ta dəmin sərildi yerə.* A.Səhhət.

**DƏMİR** *is.* 1. Təbiətdə çox yayılmış, karbonla birləşdikdə polad və çuqun əmələ gətirən bozrəngli ağır kimyəvi element. *Dəmir*

*mədəni. Dəmir parçası. – Ahənrüba .. dəmiri cəzb edir, yəni özünə çəkir.* C.Məmmədquluzadə. // Dəmir parçası, dəmir təbəqəsi, dəmir çubuq. *Aslan həyətdə paslı dəmir üstündə oturub, Bayramın yolunu gözləyirdi.* M.Hüseyn. // Ümumiyyətlə, dəmirdən qayrılmış şey, ya şeylər. *Evin damı dəmirdir. Qapı dəmirdəndir.*

2. Dəmirdən qayrılmış, dəmirdən hazırlanmış. *Dəmir kassa. Dəmir mil.* – [Gülsənəm] *otağın düz ortasında qoyulmuş dəmir peçi qaladı.* M.Hüseyn. // Məc. mənada. *Dəmir qanadlar. – Dəmir atlar dolaşır şimalın meşəsini.* R.Rza.

3. *tib*. Tərkibində dəmir preparatı olan dərman.

4. *məc*. Möhkəm, yenilməz, sarsılmaz. *Dəmir iradə.* – [Qara kişi] *sərt xasiyyətli, dəmir iradəli, eyni zamanda mehriban qəlbli bir adam idi.* Ə.Sadıq. // *məc*. Eyni mənada təşbeh və müqayisələrdə. *Dəmir, beton kimi sıxdır sıramız.* M.Müşfiq. *Hər tərəfdə yeni dünya qurulur; Sərt sulara dəmir bəndlər vurulur.* Z.Xəlil.

◊ **Dəmir dövrü** *arxeol.* – ibtidai icma dövründə insanların əmək alətləri qayırmaq üçün əsas material olaraq dəmir işlətməyə başladıqları dövr. **Dəmir yolu** – 1) qatarların hərəkət etməsi üçün relsli yol. *Dəmir yolu çəkmək. – O ki qaldı, nə bilim, dəmir yolu, telefon, teleqram .. onların mənasını Əhməd bəy başa düşmür.* C.Məmmədquluzadə; 2) relsli yollara, qatarlara və qatarların hərəkətinə xidmət və bu işləri təşkil etməklə məşğul olan idarələrin məcmusu. *Dəmir yolunda işləmək.*

**DƏMİRAĞAC** *is. bot*. Oduncağı çox bərk və ağır olan qiymətli ağac növü (Azərbaycanda Talış meşələrində bitir).

**DƏMİR-BETON** *is. xüs*. 1. Betonla polad armaturun birləşməsindən ibarət çox bərk tikinti materialı. *Dəmir-betondan hörülmüş sədd.*

2. *Sif. mənasında.* Həmin materialdan qayrılmış. *Dəmir-beton körpü. Dəmir-beton qurğu. – Bolqarıstan hökumətinin hədiyyə olaraq* [Üskündə] *tikdirdiyi "Universal zal" adlı dəyirmi, dəmir-beton binanın geniş salonunda .. poeziya festivalının son gecəsi oldu.* R.Rza.

**DƏMİRBƏND** *sif.* Dəmirlə bərkidilmiş, bağlanmış.

**DƏMİR-BOZ** *sif.* Dəmiri və boz rəngə çalan. *Dəmir-boz at.*

**DƏMİRÇİ** *is.* Dəmirdən müxtəlif şeylər qayıran, yaxud dəmir şeyləri təmir edən usta. *Məncə, hər yazıdan daha parlaqdır; Kiçik dəmirçinin alnındakı tər.* Ə.Cavad. *Bir qoca dəmirçi qılınc naxışlar; Yazar dəstəyinə "İnsan vüqarı".* M.Araz.

**DƏMİRÇİXANA** *is.* Dəmirdən şeylər qayrılan və ya təmir edilən yer; dəmirçinin işlədiyi bina, dəmirçi emalatxanası. *Dəmirçixanada dəmiri zindan üstə qoyub ağır çəkiclə döyəndə dəmir başlayır qızmağa.* C.Məmmədquluzadə.

**DƏMİRÇİLİK** *is.* Dəmirçinin peşəsi, sənəti, işi. *Dəmirçilik etmək. – Təbibə ehtiyacı çox olan məmləkətlərdə insanın təbibliyə olan marağı hər şeydən artıqdır. Elə də dəmirçilik, xarratlıq, dərzilik və başmaqçılıqdır.* M.S.Ordubadi.

**DƏMİRDONLU** *sif. tar*. Dəmirdən zirehli geyim geymiş; zirehli. *Bəylərimizə dəmirdonlu deyərlər; Daim içimizdə ərlik işlənir.* "Koroğlu".

**DƏMİR-DÜMÜR** *top. dan*. Dəmir parçaları, yaxud dəmirdən qayrılmış şeylər. *Əlisa dönüb yavaş-yavaş, dəmir-dümürdən tuta-tuta qapının ağzına gəldi, salam verdi.* S.Rəhimov. *Gətirin dəmir-dümürü görək, tez olun!* Ə.Əbülhəsən. // Lazımsız dəmir parçaları, dəmir tullantıları.

**DƏMİRƏBƏNZƏR** *sif.* Dəmirə oxşayan, dəmir rəngində olan.

**DƏMİRXANA** *is.* b a x **dəmirçixana**. *Amma Hüseynqulunun Təzə şəhərdə bir mexanik sexi düzəltməyi, təmirxana, dəmirxana qurmağı mənim üçün bilirsən nə olar?* Mir Cəlal.

**DƏMİRİ** *sif.* Dəmir rəngli, dəmir rənginə çalan. *..Yol, Zeynalın altındakı dəmiri göy atı qaçmağa daha da həvəsləndirdi.* Ə.Əbülhəsən.

**DƏMİRKƏSƏN** *sif.* Dəmiri kəsmək üçün yarayan, metalı kəsən. *Dəmirkəsən alət.*

**DƏMİRQARA** *is*. *bot*. Vələs ağacının meşələrdə bitən bir növü.

**DƏMİRLƏŞDİRİLMƏ** "Dəmirləşdirilmək"dən *f.is.*

**DƏMİRLƏŞDİRİLMƏK** *məch*. Dəmirlə möhkəmləndirilmək.

**DƏMİRLƏŞDİRMƏ** "Dəmirləşdirmək"-dən *f.is.*

**DƏMİRLƏŞDİRMƏK** *f.* Dəmirlə möhkəmlətmək. *Bəndi dəmirləşdirmək. Divarı dəmirləşdirmək. Tağları dəmirləşdirmək.*

**DƏMİRLƏŞMƏ** "Dəmirləşmək"dən *f.is.*

**DƏMİRLƏŞMƏK** *f.* 1. Dəmir halına gəlmək.

2. Bərkləşmək, möhkəmləşmək.

**DƏMİRLİ** *sif. kim*. Tərkibində dəmir olan. *Bu* [mineral] *sular kimyəvi tərkiblərinə görə dəmirli, qələvili, kükürdlü, mərgümüşlü, narzan tipli, karbon qazlı və sairə sulardır.* R.Əliyev.

**DƏMİRTİKAN** *is.* 1. *bot*. Gövdəsi yerə sərilən tikanvari bitki.

2. Sahələri hasarlamaq üçün işlədilən tikanlı məftil. *Səngərlərin qabağına dəmirtikan çəkmək.*

**DƏMİRTİKANLIQ** *is.* 1. Çoxlu dəmirtikan (1-ci mənada) bitən yer.

2. Dəmirtikanlardan hasar çəkilmiş yer.

**DƏMİRYAYAN** *sif. tex*. Dəmiri yayıb yastı hala salan. *Dəmiryayan dəzgah.* // *is.* Dəmiri yayma ustası olan fəhlə.

**DƏMİRYOL** *is.* Dəmir yolu ilə əlaqədar olan (işçi və s.); dəmir yolu üçün olan (stansiya və s.). *Dəmiryol işçisi. Dəmiryol təmiri. – ..Ağca xanım pəncərədən baxdı, oradan dəmiryol stansiyası görünürdü.* S.S.Axundov.

**DƏMİRYOLÇU** *is.* Dəmiryol nəqliyyatı işçisi. *Sifətini qulaqlı papaq altında gizlətmiş dəmiryolçu qarşımdan ötürdü.* Mir Cəlal. [Qədirin] *əynində dəmiryolçu pencəyi var idi.* Ə.Sadıq.

**DƏMİRYONAN** *sif. tex*. Dəmiri yonaraq müəyyən şəklə salan. [Qonaqlar] *taxtakəsən, dəmiryonan dəzgahların .. komandirlərini danışdırıb sevinir, qibtə edirdilər.* Mir Cəlal.

**DƏMKEŞ** *is.* [*fars*.] 1. Üzərinə çaydan qoymaq üçün samovar odluğunun yuxarı hissəsinə geydirilən və yanlarda deşikləri olan hissə. *Yazıçı məişətdən danışarkən samovarın dəmkeşinə qədər xırda, lakin əhəmiyyətli detalları unutmur.* M.İbrahimov.

2. Xörəyin dəm alması üçün qazanın ağzına qoyulan qapaq. *Göyçək arvad dəmkeşi qazanın ağzından götürüb xörəyin dəmini alır.* Ə.Vəliyev.

3. Sobaların bacalarında və s.-də dəm çəkmək üçün qoyulan deşik.

4. B a x **züyçü**.

**DƏMKEŞLİK** *dan*. b a x **züyçülük** 1-ci mənada.

**DƏMLƏMƏ** "Dəmləmək"dən *f.is.*

**DƏMLƏMƏK** *f.* 1. Çayı, xörəyi dəm çəkməyə qoymaq. // Çayı, qəhvəni dəmə qoyub içmək üçün hazır etmək. *Samovar gəldi, Xəlil çay dəmlədi, Fəraməzin mürəbbəsi olduğunu bilirdi.* Çəmənzəminli.

2. Çox qızdırmaq, həddindən artıq isti etmək. [Koxa:] *Əşi, sən bu ocağı dəmləməkdən nə ləzzət alırsan?* S.Rəhimov.

3. Musiqi alətlərini çalmaq üçün hazırlamaq, sazlamaq, səslərini bir-birinə uyğunlaşdırmaq.

**DƏMLƏNDİRMƏ** "Dəmləndirmək"dən *f.is.*

**DƏMLƏNDİRMƏK** *f.* 1. Dəmə qoymaq, dəm çəkdirmək. *Çayı dəmləndirmək.*

2. *məc*. Kefləndirmək, nəşələndirmək. *İçki onu dəmləndirmişdir*.

**DƏMLƏNMƏ** "Dəmlənmək"dən *f.is.*

**DƏMLƏNMƏK** 1. *məch*. Dəm çəkmək üçün odun üstünə qoyulmaq; dəm almaq. *Çay dəmlənmişdir*.

2. *f. məc. dan*. Cuşa gəlmək, şadlanmaq, ruhlanmaq, nəşələnmək. *Dəmlənib oxuyurlar; Ürəkləri cuşa gəlir.* Aşıq Əli.

**DƏMLƏNMİŞ** *f.sif.* 1. Dəmə qoyulmuş; dəm almış. [Zərbəli:] *Qəhvə yoxdur. Yaxşı təzə dəmlənmiş Popov çayımız var.* Ə.Haqverdiyev. *Stolun üstündə təzə dəmlənmiş çay buğlanır, yanında iki cür mürəbbə görünürdü.* Ə.Vəliyev.

2. *məc*. Keflənmiş, nəşələnmiş, ruhlanmış. *Mənə acığın tutmasın, Zərif! – deyə, az-çox dəmlənmiş Müqim bəy göz yaşlarını gizlədə bilmədən üzrxahlıq edirdi.* S.Rəhimov.

**DƏMLƏTMƏ** "Dəmlətmək"dən *f.is.*

**DƏMLƏTMƏK** *f.* Dəm almağa qoymaq. *Çay dəmlətmək*.

**DƏMLİ** *sif.* 1. Dəm almış, dəmə qoyulmuş. *Dəmli çay. Dəmli plov*.

2. Dəm qazı dolmuş, dəm qazı ilə zəhərlənmiş; boğanaq, boğucu. *Dəmli otaq*.

3. *məc*. *dan*. Şən, nəşəli, ürəkaçan. *Bizlərə dəmli qız gərək; Xətli, qələmli qız gərək!* Ə.Nəzmi.

4. *məc*. Kefli, sərxoş. *Mən dənizçiyəm, özüm də adətim üzrə bu saat dəmliyəm.* "Kirpi".

**DƏMLİ-DƏSGAHLI** *dan*. b a x **dəmdəsgahlı**. *Dəmli-dəsgahlı otaq. – Bu, qurulu bir imarət idi, .. bərli-bəzəkli, dəmli-dəsgahlı bir ev idi.* Mir Cəlal.

**DƏMLİK** b a x **dəmkeş** 1, 2 və 3-cü mənalarda.

**DƏMRƏK** *is. bot*. Dodaqçiçəklilər fəsiləsindən yemliyə oxşar bir və çoxillik ot, bir qismi isə yarımkol bitki.

**DƏMRO(V)** *is.* 1. *tib*. Xüsusi göbələklərin törətdiyi dəri xəstəliklərindən biri. *İtlər insanların qoturluq, keçəllik, dəmrov kimi dəri xəstəliklərinə tutulmalarına səbəb olur*.

2. Bu xəstəliyin bədəndə qalan yeri, ləkəsi. *Onun sağ yanağındakı balaca dəmrov çox tez nəzərə çarpırdı.* M.Hüseyn. ☐ **Dəmro(v) alası** – b a x **dəmro(v)** 2-ci mənada.

**DƏMROVLU** *sif.* Dərisinə dəmrov düşmüş, dəmrov basmış, dəmrov ləkələri olan. *Dəmrovlu pişik. Dəmrovlu üz. – Mirzə kinə rəngində, dəmrovlu bir sifət gördü..* İ.Məlikzadə.

**DƏMROVOTU** *is. bot*. Təbabətdə işlənən çoxillik şirəli ot bitkisi. *Dəmrovotu çoxillik bitki olub 70 sm hündürlükdə budaqlı gövdəyə malikdir. Bütün hissələrində çəhrayı rəngli süd şirəsi vardır.* R.Əliyev.

**DƏMSAZ** *is.* [*fars*.] *klas*. 1. Yoldaş, həmdəm. *Həmrazim idin şikayətimdə; Dəmsazim idin hekayətimdə.* Füzuli.

2. Uyğun, müvafiq. *Bir kəsə olmasa zəmanə dəmsaz; Çox adamlar alar üstünə ayaq*. Q.Zakir.

3. Musiqidə: əsas çalana kömək edən və ona həmahəng çalan çalğıçı. *Sonralar başqaları da dinlədikləri mahnıları təkrar etmək, ya da solo oxuyan adama vagirlik etmək, dəmsaz olmaq yolu ilə toplanışda yaxından iştirak etməyə çalışmışlar.* Ə.Bədəlbəyli.

4. B a x **dəmtutan**.

**DƏMSAZLIQ** *is. köhn*. 1. Yoldaşlıq, həmdəmlik; yoldaşlıq etmə.

2. Uyğunluq, müvafiqlik.

**DƏMSİZ** *sif.* Dəm almamış.

**DƏMSİZLİK** *is*. Dəm almama, dəmi olmama.

**DƏMTUTAN** *is.* 1. Züyçü. *Zurnaçının dəmtutanı.*

2. *məc*. Fərqinə varmadan başqasının sözünü, fikrini müdafiə və təkrar edən adam.

**DƏMYƏ** 1. *is. k.t.* Suvarılmayan yer. *Bu torpaq dəmyədir. // Sif. mənasında*. Bu yerlərdə əkilən. *Dəmyə taxıl. Dəmyə bostan*. – ..[Bəxtiyarın] *çöldə bir qədər dəmyə əkini vardı.* S.Hüseyn. *Bu il havaların yaxşı keçməsi, tez-tez yağış yağması dəmyələri göm-göy etmişdi.* İ.Şıxlı.

2. B a x **daşma**[2]. *Mən belə dəmyəni yeyə bilmərəm; Dərdimi sərdara deyə bilmərəm.* (Mahnı).

**DƏMYƏÇİ** *is. dan. k.t.* Dəmyə əkməklə məşğul olan kəndli.

**DƏMYƏÇİLİK** *is. dan. k.t.* Dəmyə əkini. // Dəmyə əkməklə məşğul olma.

**DƏMYƏLİK** *is.* 1. *k.t.* Dəmyə üçün ayrılmış yer, dəmyədə əkilmiş taxıl və s.

2. Dəmyə bişirmək üçün lazım olan (düyü və s.).

**DƏN** *is.* 1. Dənli bitkilərin məhsulunun hər bir dənəsi, ayrı-ayrı toxumu, tumu. *Dənin ağırlığından sünbüllər başını əyir, biçinçilərə gəl-gəl deyir.* Mir Cəlal. *Qarğıdalının da dəninin çox hissəsi sulu karbonlardan ibarətdir.* ☐ **Dən bağlamaq (tutmaq)** – dənli bitkilərdə dən əmələ gəlmək, başaq bağlamaq, toxumlanmaq. *Əzizim nədən bağlar; Pərvanə nədən bağlar; Əkmə namərd zəmisin; Nə bitər, nə dən bağlar.* (Bayatı). **Dənə düşmək** – çox dən yeməkdən xəstələnmək (bəzi ev heyvanları haqqında).

2. Ümumiyyətlə, taxıl, buğda, arpa, düyü və s. dənli bitki məhsulu. *Dəyirmanda dənin yox, şahad üstə başımı niyə yarırsan?* (Ata. sözü).

3. Quş yemi. *Quş dənə yığılar, çibin şirəyə.* (Ata. sözü). *Sənəm qarı balağından çəngə ilə*

*dən götürüb toyuq-cücələrə səpirdi.* Ə.Məmmədxanlı.

4. *məc.* Saç və saqqalda tək-tək ağ tük. *Kiçik bir zeh açdı saçlarına dən; Başda çiçək açar insan hünəri.* S.Vurğun. ☐ **Dən düşmək (saça, saqqala)** – 1) tək-tük ağarmaq. *Nə erkən sənə dən düşdü, .. Beynimmi qüvvədən düşdü? Ağarma, saçım, ağarma!* M.Araz. *Deyirəm gücümü elə vermişəm; Saçıma dən düşsə, qoy düşsün, nə qəm.* R.Rza. *Artıq alnım qırışdı, saçlarıma düşdü dən.* Ə.Cəmil; 2) ağarmağa başlamaq, yetişməyə başlamaq. *Dağlara çən düşəndə; Sünbülə dən düşəndə; Ruhum qəfəsdə oynar; Yadıma sən düşəndə.* (Bayatı).

**DƏNAB** *is.* [*fars.*] Xörək bişirmək üçün qaynar su.

**DƏNCİK** *is.* Kiçik dən, xırda dən.

**DƏNDAN** *is.* [*fars.*] *klas.* Diş. *Olmasa qabil əgər dəhr cəfa verməz ona; Təm biləzzət olanda necə dəndanə dəyər?* M.V.Vidadi. *Əvvəl səyin verib ləbə, dəndana; Onun üçün mumca nəfi var cana.* Q.Zakir.

**DƏNDƏ** b a x **dəndənə** 1-ci mənada.

**DƏN-DƏN** *zərf* 1. Dənələri ayrı-ayrı duran, bir-birinə qarışmayan (yapışmayan). *Plovun düyüsü dən-dən idi.* Ə.Vəliyev.

2. Damcı-damcı, gilə-gilə. *Şollar suyu çiçək kimi dən-dən olub hovuza tökülür..* Mir Cəlal. *Hərdən yağış damcıları axıb dən-dən; Düşür yerə yarpaqların üzərindən.* B.Vahabzadə.

**DƏNDƏNƏ** *is.* [*fars.*] 1. Təkərin çevrəsini mərkəzə birləşdirən taxta. *Arabanın bir dəndənəsi sınmışdır.* – [Arabaçı:] *..Atlar arıq, minik çox, hərənin də bir bağlaması var, qorxuram dəndənələr tab gətirməyə.* "Kirpi".

2. *tex.* Müxtəlif mexanizmlərdəki dişli çarxların dişləri, çıxıntıları.

3. *mem.* Binaların kənarlarındakı diş-diş naxış.

4. Qapıları bərkitmək üçün onların dal tərəfində qayrılan dişli siyirmə. *Qapının dəndənəsi.*

5. Qulp, dəstə. *Sənəyin dəndənəsi.*

**DƏNDƏNƏLƏMƏ** "Dəndənələmək"dən *f.is.*

**DƏNDƏNƏLƏMƏK** *f.* Dəndənəli etmək, dəndənələr düzəltmək, diş-diş etmək, qırçınlamaq.

**DƏNDƏNƏLƏNMƏ** "Dəndənələnmək"-dən *f.is.*

**DƏNDƏNƏLƏNMƏK** *məch.* Dəndənələr düzəldilmək, diş-diş edilmək, qırçınlanmaq.

**DƏNDƏNƏLİ** *sif.* Dəndənəsi olan. *O, dəndənəli sənəyindən yapışıb kürəyinə atdı.* S.Rəhimov.

**DƏN-DÜŞ** *is.* Keyfiyyətsiz və qarışıq heyvan yemi.

**DƏNƏ** *is.* [*fars.*] 1. Eyni cinsdən olan şeylərin hər biri, ədəd (cansız şeyləri sayarkən işlədilir). *Beş dənə kitab. İki dənə alma.* – *Hacı Məcid əfəndinin Diyallı kəndindəki atadanqalma evi məhz iki-üç dənə balaca örtülüdən ibarətdir.* C.Məmmədquluzadə. *Telli özünə toxuduğu yun corabı aldı. Onun üstünə bir on dənə yumurta qoyub Molla Xəlilin yanına getdi.* S.Hüseyn. ☐ **Bir(cə) dənə** – tək, yalnız, vahid. *Balamsan, bir dənəsən; Sədəfsən, dürdanəsən; Mən ölsəm, sənə qurban; Sən ölmə, bir dənəsən.* (Layla). *Gözəllər içrə sən, ey mahiparə, bir dənəsən; Gözəllərin gözüsən, zülfü qarə, bir dənəsən.* Ə.Vahid.

2. Dənli bitkilərin məhsulunun hər bir dəni. *Düyü dənəsi.* – *Bir taxıl dənəsi itməsin deyə; Gündüzə qarışır gecələrimiz.* B.Vahabzadə.

3. Səpələnən, yaxud ovulan şeylərin ən kiçik hissəcikləri. *Qum dənələri.* – *Qəhvənin dənələrinə qeyri dənələr qarışdırıb satırlar, onu tanımaqdan ötrü qovurub qaynar suya atanda o dənələr partlayıb dağılır.* H.Zərdabi.

4. Çəyirdək, toxum, tum. *Arvad bir də baxır ki, molla iydələrin dənəsini də yeyir.* "M.N.lətif."

**dənə-dənə** *zərf* Hər dənəsini ayrıca, bir-bir, dən-dən. *Tutu dənə-dənə yığmışam.*

**DƏNƏCİK** *is.* Kiçik dənə, xırda dənə. *Fəqirə üzü yumurta sarısıyla suvaqlı, xaş-xaş dənəciklərilə naxışlı o nazik, uzunsov sarı buğda çörəyindən biri .. qismət olacaqdı.* Ə.Məmmədxanlı.

**DƏNƏCİKLİ** *sif.* Xırda dənələri olan.

**DƏNƏ-DƏNƏ** *sif.* Dənələr halında.

**DƏNƏ-DƏNƏLİK** *is.* Dənələr halında olma.

**DƏNƏLƏMƏ** "Dənələmək"dən *f.is.*

**DƏNƏLƏMƏK** *f.* Dənələrini ayırmaq; arıtmaq. *Qarğıdalını dənələmək. Narı dənələmək. Buğdanı dənələmək.*

**DƏNƏLƏNMƏ** "Dənələnmək"dən *f.is.*

**DƏNƏLƏNMƏK** *məch*. Dənələri ayrılmaq; arıdılmaq. *Təsbeh kimi dənələndim qovğa yolunda..* M.Araz.

**DƏNƏLƏTDİRİLMƏ** "Dənələtdirilmək"-dən *f.is.*

**DƏNƏLƏTDİRİLMƏK** *məch*. Dənələrə ayırtdırılmaq; arıtdırılmaq.

**DƏNƏLƏTDİRMƏ** "Dənələtdirmək"dən *f.is.*

**DƏNƏLƏTDİRMƏK** "Dənələtmək"dən *icb.*

**DƏNƏLƏTMƏ** "Dənələtmək"dən *f.is.*

**DƏNƏLƏTMƏK** "Dənələmək"dən *icb.*

**DƏNƏLİ** *sif.* 1. Dənli, dəni çox olan. *Dənəli sünbül.*

2. Dənələri ayrı-ayrı seçilən. *Qətibə əlini atıb kiçik bir şəddə iri dənəli inci çıxarıb Səba xanımın boynuna saldı.* M.S.Ordubadi.

**DƏNƏMUZD** *sif. iqt*. Əmək haqqı istehsal olunan maddi nemətlərin sayına görə ödənilən. *Dənəmuzd fəhlə. Dənəmuzd iş.*

**DƏNƏVƏR** *sif.* 1. Dənəli, dənlər halında, dənələri iri olan. *Dənəvər gübrə. Dənəvər torpaq.*

2. Dənələri bir-birindən seçilən, qarışıq olmayan. *Yaxşı dəm çəkmiş plov dənəvər, elastik .. olmalıdır.*

**DƏNƏVƏRLƏNDİRİLMƏ** "Dənəvərləndirilmək"dən *f.is.*

**DƏNƏVƏRLƏNDİRİLMƏK** b a x **dənəvərləşdirilmək**.

**DƏNƏVƏRLƏNMƏ** "Dənəvərlənmək"-dən *f.is.*

**DƏNƏVƏRLƏNMƏK** *f.* Dənəvər hala düşmək, dənələrdən ibarət olan tərkib hissələri bir-birindən ayrılmaq. // Eyni mənada qalın saç haqqında. *Qız, gözəl başını tərpətdikcə bu saç dənəvərlənir, tel-tel olub onun yanaqlarını, çənəsini oxşayırdı.* Ə.Əbülhəsən.

**DƏNƏVƏRLƏŞDİRİLMƏ** "Dənəvərləşdirilmək"dən *f.is.*

**DƏNƏVƏRLƏŞDİRİLMƏK** *məch*. Dənəvər hala salınmaq. [Məruzəçi] *kənd təsərrüfatı bitkilərinin məhsuldarlığına mədən gübrəsi ilə üzvi gübrə qarışığının, habelə dənəvərləşdirilmiş gübrənin təsiri haqqında məruzə etdi.*

**DƏNƏVƏRLƏŞDİRMƏ** "Dənəvərləşdirmək"dən *f.is.*

**DƏNƏVƏRLƏŞDİRMƏK** *f.* Dənəvər etmək, dənəvər hala salmaq.

**DƏNƏVƏRLƏŞMƏ** "Dənəvərləşmək"-dən *f.is.* [Xaşa] *çox yayılaraq torpağın yaxşı dənəvərləşməsini təmin edir.*

**DƏNƏVƏRLƏŞMƏK** *f.* Dənəvər hala düşmək. *Torpaq dənəvərləşir və alaq otları azalır.*

**DƏNƏVƏRLİK** *is.* 1. Dənəvər şeyin halı, çox dənlilik.

2. Dənə-dənə ayrılma, parçalanma.

**DƏNƏZƏN** *is. tex*. Dənin yeyilməsini asanlaşdırmaq üçün onu xırdalayan və əzən maşın. *Yemləri hazırlamaq üçün bölmələrə küləşdoğrayan, dənəzən, kartofyuyan maşınlar qoyulmalıdır.* "Ümumi zootexniya".

**DƏNG¹: dəng eləmək (etmək)** (bəzən "başını", "baş-beynini", "qulağını" sözləri ilə) – çox və bərk danışmaqla, qışqırmaqla, səs-küy salmaqla bezikdirmək, adamın başını, qulaqlarını yormaq; baş-qulaq aparmaq. *Dəng eləmişdi xalqı sədayi-nəvaların.* Q.Zakir. *Sən də çox başımı dəng eyləmə, doldur çubuğu; Mən behişt istəmirəm, aləmə elan olsun!* M.Möcüz. // Bıqdırmaq, narahat etmək, zəhləsini aparmaq. *Yarın fikri, xəyalı; Məni gecə dəng edər.* Sarı Aşıq; **dəng olmaq** (bəzən "qulaq" sözü ilə) – səsdən-küydən və s.-dən qulaqları batmaq, başı yorulmaq, təngə gəlmək, üzülmək. *Səs-küydən, qışqırıqdan dəng olduq. – Bilməm nə görübdür bizim oğlan oxumaqdan; Dəng oldu qulağım.* M.Ə.Sabir.

**DƏNG²** *is.* 1. *məh*. Bərabər, tay. *Sən ona dəng deyilsən.*

2. *dan*. Cüzi bir hissə, bir dənə. *Çin mülkünə verməm saçının dəngini.* M.P.Vaqif. *Mah ilən hüsnünün xoş rənginə; Yetə bilməz təcnisimin dənginə.* Aşıq Pəri.

3. *köhn*. Qara xırda pul; qəpik-quruş. *Dəvənin biri dəngə, vay dəng dərdi.* (Ata. sözü).

4. *məh*. Bir yerdən başqa yerə aparmaq üçün bağlanan tay, top, bağlama. *İpək dəngi. Kağız dəngi.*

**DƏNGƏNƏ** *is. məh*. Kasaya oxşayan kiçik saxsı qab. *Dəngənədə qatıq çalmaq.*

**DƏNGƏSƏR: dəngəsər etmək (eləmək)** – b a x **dəng etmək** (**"dəng[1]"**də). *Oğul mənimdir əgər, oxutmuram, əl çəkin! Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!* M.Ə.Sabir. **Dəngəsər olmaq** – b a x **dəng olmaq** (**"dəng[1]"**də). *Yatanlar hamısı dəngəsər olub oyandı.* Ə.Vəliyev.

**DƏNGİL** *sif. dan.* Xal-xal, xallı.

**DƏNGİL-DƏNGİL** *sif. dan.* Çoxlu xalları olan, xallı, xal-xal.

**DƏNGİL-DÜNGÜL** *sif. dan.* Seyrək, aralı. *Dəngil-düngül ağaclıq.*

**DƏNGÜLÜŞ** *sif. dan.* Yüngül, qeyri-ciddi, dingiliş. *Dəngülüş adam.*

**DƏNXIRDALAYAN** *sif.* və *is. tex.* Dəni üyüdüb yarma halına salan. *Dənxırdalayan maşın.* // *is.* Dəni üyüdüb yarma halına salan maşın və s.

**DƏNİ** *sif.* [*ər.*] Alçaq, rəzil. *..Dəni məqsədlilərin burada şəltəsi işləməz.. Onları kənar etmək, öz məqamlarına qovmaq lazımdır.* Ü.Hacıbəyov. *Bəzən mühit ən gözəl, ən mərhəmətli və sevimli bir qızı dəyişdirib ən dəni, alçaq və cani bir şəklə də sala bilər.* M.S.Ordubadi.

**DƏNİZ** *is.* 1. Yer kürəsinin acı-duzlu su ilə örtülü olan və az-çox quru ilə əhatə olunmuş böyük sahəsi, okeanın bir hissəsi; dərya. *Qara dəniz. Xəzər dənizi. – Dəniz okeanların az-çox təcrid edilmiş hissələridir ki, bunların özlərinin xüsusi rejimi vardır.* "Ümumi fiziki coğrafiya". // Acı-şor suyu olan çox böyük göl. *Aral dənizi. – Dənizdə tufan qalxır. Xəzərin ağ köpüklü çılğın dalğaları sahili gəmirirdi.* M.Hüseyn. // Yer üzündəki okean və dənizlərin məcmusu. *Dənizlə Amerikaya getmək.* // Süni surətdə düzəldilmiş çox böyük sututar. *Mingəçevir dənizi. – Xəritədə Azərbaycan düzlərini sulamaq üçün bu dənizdən çəkilən kanalların şəbəkəsi görünürdü.* Ə.Sadıq. ☐ **Dəniz nəqliyyatı** – dənizlərdə işləyən nəqliyyat vasitələri (gəmilər və s.).

2. *məc.* Təşbehlərdə, müqayisələrdə çoxluq, nəhayətsizlik, intəhasızlıq bildirir. *Xəyalımız üzəydi sövda dənizlərində; Ləpələr üzərində.* M.Müşfiq. *Tərlan izdihama yaxınlaşdıqca, elə bil onun qarşısında böyük bir insan dənizi dalğalanırdı.* M.Hüseyn.

◊ **Dəniz tutmaq** – gəminin yırğalanması nəticəsində ürəkbulanması və başağrısı şəklində təzahür edən xəstəlik halı. **Dənizdə balıq sövdası** – ortada mövcud olmayan qeyri-real bir şey haqqında söhbət aparma. *Dənizdə balıq sövdası olmaz.* (Ata. sözü). **Dənizdə bir damcı** – müqayisəedilməz dərəcədə az, çox cüzi bir şey haqqında.

**DƏNİZARIDAN** *sif.* və *is. tex.* Dənizin dayaz yerlərini dərinləşdirən (gəmi).

**DƏNİZAŞIRI** *sif.* Dənizin o tayında olan, dənizin o tərəfində olan. *Dənizaşırı ölkələr.*

**DƏNİZATI** *is. zool.* Sahil yosunları arasında yaşayan kiçik balıq; dənizayğırı.

**DƏNİZAYĞIRI** b a x **dənizatı**. *Dənizayğırının dərisi, onu yosun budaqları arasında çox yaxşı gizlədir.* "Sualtı aləm".

**DƏNİZCİK** *is.* Kiçik dəniz; göl.

**DƏNİZÇİ** *is.* Dəniz nəqliyyatında və ya hərbi dəniz donanmasında xidmət edən adam. *Dənizçilər marşı. – Bizim dənizçilərdir; Çovğunda, qışda, qarda; Qorumaqçın sahili; Üzür doğma sularda.* M.Seyidzadə.

**DƏNİZÇİLİK** *is.* Dənizdə xidmət etmə, dənizçi sənəti.

**DƏNİZXİYARI** *is. zool.* Dərisitikanlılar tipindən xiyara bənzəyən dəniz heyvanı. *Dərisindəki xırda kirəc cisimciklərin və beş cərgə ayaqların olmasına görə, dənizxiyarlarının dənizkirpiləri, dənizulduzları və dənizzanbaqları sinfindən olduğunu görürük.* "Sualtı aləm".

**DƏNİZKƏNARI** *sif.* Dəniz kənarında olan, dəniz sahilinə yaxın olan. *Dənizkənarı küçə. – Bakılılar hər axşam dənizkənarı bulvara çıxırlar.*

**DƏNİZKİRPİSİ** *is. zool.* Dərisitikanlılar tipindən yastı kürə şəklində heyvan. *Dənizkirpisi, adətən, azacıq yastı kürə şəklində olub, üzərində beş cərgə nazik və şəffaf sorucu ayaqları vardır.* "Sualtı aləm".

**DƏNİZ QARANQUŞU** *is. zool.* Zirehli kiçik dəniz balığı.

**DƏNİZQIRAĞI** b a x **dənizkənarı**.

**DƏNİZOTU** *is. bot.* Birləpəli bitkilər fəsiləsindən dənizdə bitən çoxillik su bitkisi. *Alimlər dənizotundan təbii neftə oxşar süni neft almağa müvəffəq olmuşlar.*

**DƏNİZPƏRİSİ** *is.* Nağıllarda: suda yaşayan, saçları üzünə tökülmüş, çılpaq, balıq quyruqlu qadın surətində təsəvvür edilən əfsanəvi vücud.

**DƏNİZPİŞİYİ** *is. zool.* Qiymətli qara dərisi (xəzi) olan dəniz heyvanı. *Qiymətli yumşaq xəzli dənizpişikləri törəyib çoxalmaq üçün adalara çıxırlar.* "Sualtı aləm".

**DƏNİZSOĞANI** *is. bot.* İri yarpaqları olan çoxillik soğanaqlı ot bitkisi (təbabətdə istifadə olunur). *Dənizsoğanı birləpəli çoxillik ot bitkilərindən olub, çəkisi iki qrama çatan böyük və quru yarpaqlı soğan yumrularına malikdir.* R.Əliyev.

**DƏNİZŞEYTANI** *is. zool.* Dəniz dibində yaşayan enliağızlı balıq. *Dənizşeytanı adlanan balıq dənizin dibində sakitcə uzanıb başındakı xırda bığlarını tərpədir.* "Sualtı aləm".

**DƏNİZTISBAĞASI** *is. zool.* Ayaqları avar şəklində olan iri tısbağa. *Dəniztısbağalarının ayaqları avara çevrilmişdir.* "Sualtı aləm".

**DƏNİZULDUZU** *is. zool.* Dərisitikanlılar tipindən beşguşəli dəniz heyvanı.

**DƏNİZZANBAĞI** *is. zool.* Dəniz dibində yaşayan bitkiyə oxşayan bir heyvan. *Çiçəyə bənzəyən dənizzanbağı dənizin dibində nazik ayaqcıqlar üzərində yırğalanaraq yaşayır. Bu, bitki deyil, heyvandır.* "Sualtı aləm".

**DƏNQURUDAN** *sif. xüs.* Dəni qurutmağa yarayan. *Dənqurudan cihazlar.*

**DƏNLƏMƏ** "Dənləmək"dən *f.is.*

**DƏNLƏMƏK** *f.* 1. Dənli yemləri bir-bir dimdiklə götürüb yemək (quşlar haqqında). *Toyuqlar darını dənlədilər.*

2. Meyvəni ağacdan bir-bir qoparıb toplamaq, yığmaq, dərmək. *Meyvələri dənləmək.*

3. Arıtlamaq, təmizləmək, irini xırdadan, yaxşını pisdən ayırmaq. *Buğdanı dənləmək. Düyünü dənləmək.*

4. *məc.* Bir-bir qırmaq, öldürmək, tələf etmək, ortadan qaldırmaq. *Elə, başçıları qırıb dənləsək; Qorxudan çəkilər yerdə qalanlar.* S.Vurğun. *İlyas sərrast atəşlə* [düşmən] *zabitlərini bir-bir dənləyirdi.* Mir Cəlal. *Bizim avtomatçıların atəşi* [faşistləri] *bircəbircə dənləyirdi.* M.Hüseyn.

**DƏNLƏNMƏ** "Dənlənmək"dən *f.is.*

**DƏNLƏNMƏK** *f.* Dən yemək, dən axtarıb yemək. *Küçədə bir neçə toyuq dənlənirdi. – Sarı toyuğum da balalarını başına toplayaraq armud ağacı altında eşələnir, dənlənirdi.* A.Şaiq. *Həyətdə yayxana-yayxana dənlənən yastı, sarıdimdikli qazların hərdənbir qaqqıltısından başqa bir şey eşidilmirdi.* Ə.Əbülhəsən.

**DƏNLƏŞMƏ** "Dənləşmək"dən *f.is.*

**DƏNLƏŞMƏK** *qarş.* Bir-birinə mane olaraq, bir-birini itələyərək bir yerdə dən yemək. *Göyərçinlər dənləşir. – Toyuqlar bir-birini dimdikləyə-dimdikləyə dənləşib qaqqıldaşır..* S.Rəhimov.

**DƏNLƏTDİRMƏ** "Dənlətdirmək"dən *f.is.*

**DƏNLƏTDİRMƏK** "Dənlətmək"dən *icb.*

**DƏNLƏTMƏ** "Dənlətmək"dən *f.is.*

**DƏNLƏTMƏK** "Dənləmək"dən *icb.*

**DƏNLİ** *sif. k.t.* Dəni çox və yaxşı olan. *Dənli sünbül. Bu taxıllar çox dənlidir. – ..Çöllər bərəkətli yaşıllıqla örtülürdü, zəmilərdə qaraqılçıq sünbüllər dənli başlarını yerə əyirdi.* Ə.Məmmədxanlı. ☐ **Dənli bitkilər** – məhsulu dən şəklində olan kənd təsərrüfat bitkiləri (buğda, arpa, qarğıdalı, çovdar və yulaf).

**DƏNLİK** *is.* 1. Dən saxlanan, ərzaq saxlanan qab, anbar. *Taxılı dənliyə tökmək.*

2. Dəyirman boğazında dən tökülən qutu; sərsərə.

3. Qursaq. *Toyuğun dənliyi.*

4. *sif. mənasında.* Əkmək üçün olan; toxumluq. *Dənlik qarğıdalı.*

**DƏNLİLİK** *is.* Dəni çox olma.

**DƏNSİZ** *sif.* Dəni olmayan, yaxud az olan. *Dənsiz sünbül.*

**DƏNSİZLƏNMƏ** "Dənsizlənmək"dən *f.is.*

**DƏNSİZLƏNMƏK** *f.* Dənsiz hala düşmək, dənsiz qalmaq, dəni tökülmək.

**DƏNSİZLİK** *is.* 1. Dəni olmama və ya az olma. *Taxılların dənsizliyi quraqlığın nəticəsidir.*

2. Yemsizlik. *Toyuqlar dənsizlikdən acdır. – Arı balsız qalar, qarışqa dənsiz; Vaxt tapmaz ot çala çəpik çalanlar.* M.Araz.

**DƏNTƏMİZLƏYƏN, DƏNTƏMİZLƏYİCİ** *sif. tex.* Dəni zibil və xırda daşlardan ayıran. *Dəntəmizləyən maşın.* // *is.* Dəntəmizləyən maşın və s. *Dəntəmizləyəni təmir etmək.*

**DƏNTUTAN, DƏNTUTUCU** *is. tex.* Dəntəmizləyən maşında və taxıldöyən kombaynda dəni zibildən və samandan ayıran hissə.

**DƏNYEYƏN** *sif. zool.* Ətyeyən quşlardan fərqli olaraq, dən yeməklə keçinən. *Toyuq, sərçə, sığırçın, bildirçin və s. dənyeyən quşlardır. – Dənyeyən quşlarda, məsələn, toyuqlarda əzələli mədə xüsusilə yaxşı inkişaf etmişdir.*

**DƏRAĞUŞ** [*fars.*] *köhn.*: **dərağuş etmək** – qucaqlamaq. *Qarşısında ağ əlbəsədə Saranın xəyalı çiçəklərə yovuqlaşır, dərağuş edir, Bəhram çəkilir.* C.Cabbarlı. **Dərağuş olmaq** – *qucaqlaşmaq. Gecə yenə Əmiraslan öz vaxtında gəldi qızın yanına. Qapıları, möhkəm eləyib oldular dərağuş.* (Nağıl).

**DƏRAMƏD[1]** *is.* [*fars.*] *mus.* Tar, yaxud kamança ilə ifa olunan muğamların giriş hissəsi. *Şur dəramədi.*

**DƏRAMƏD[2]** *is. köhn.* Gəlir, qazanc.

**DƏRAMƏDLİ** *sif. köhn.* Gəlirli, mənfəətli. *Dəramədli yer.*

**DƏRBAN** *is.* [*fars.*] *köhn.* Qapıçı. *Büsati-səltənət zövqündən əhli-eşqə əfsundur; Cahan mülkündə, ey Seyyid, dəri-dildarə dərbandır.* S.Ə.Şirvani. *Qapıların qabağında qara libaslı dərbanlar dayanıbdır.* Ə.Haqverdiyev.

**DƏRBAR** *is.* [*fars.*] Padşah sarayı. [Xacə Mübarəkə] *əmr olundu ki, cümləsini haman saat Qəzvinin altıncı küçəsinin başında müəyyən olunan evə piyada yetirsin, özü dərbari-şahiyə qayıtsın.* M.F.Axundzadə. [Xacə Firuz:] *Mən – qoca Xacə Firuz altmış ildir ki, bu dərbarda xidmət edirəm.* Ə.Haqverdiyev. [Şəmsiyyənin] *bütün vəzir ailələrinə, vəzarətxanalara və dərbara yolu açıqdı.* M.İbrahimov.

**DƏRBƏ** *is. məh.* Mal-qaranın qışlıq yem ehtiyatı.

**DƏRBƏÇƏ** *is.* [*fars.*] Balaca qapı. Ə.Abasov. // Darvazada olan balaca qapı.

**DƏRBƏDƏR** *sif.* [*fars.*] Qapı-qapı gəzən, avara, yurdsuz; ev-eşiyindən, yerindən-yurdundan avara düşmüş. // Zərf mənasında. *Ey dərbədər gəzib ürəyi qan olan çocuq! Bir loğma nan üçün gözü giryan olan çocuq!* M.Ə.Sabir. ◻ **Dərbədər düşmək (olmaq)** – qapı-qapı gəzmək, evsiz-eşiksiz qalmaq, yerindən-yurdundan olmaq. [Vəzir:] *İndi vəzarəti hər kəsə ki layiq görürsən, ona ver, mən başımı götürüb bu vilayətdən dərbədər olacağam.* M.F.Axundzadə. *Dilənmək qəsdilə düşüb dərbədər; Gəzərkən bir evdə pakizə düxtər.* Q.Zakir. **Dərbədər düşsün! (olsun!)** – qarğış ifadəsi. [Balakişi:] *Ay sizi bizim başımıza çıxardanlar dərbədər düşsünlər!* Ə.Haqverdiyev. [Xırdaxanım:] *Dərbədər olsun, məni bu evə düçar eyləyən!* N.Vəzirov. **Dərbədər etmək** – 1) bax **dərbədər qoymaq**. *Çərxi-kəcrəftar eylədi vətəndən dərbədər məni.* Q.Zakir. *Sonra gündən-günə divanəsər etdin məni sən; Məktəbimdən soyudub, dərbədər etdin məni sən.* A.Səhhət; 2) dağıtmaq, darmadağın etmək. *Aradan keçdi illər; Çarın söndü çırağı; Tarix etdi dərbədər; O qanlı təmtərağı.* Ə.Cavad. *Sən ölməklə bitməyəcək məsələ; Qoşunların dərbədər olsun gərək.* Ə.Vahid. **Dərbədər qoymaq (salmaq)** – avara salmaq, qapılara düşməsinə səbəb olmaq, evsiz-eşiksiz qoymaq, yurd-yuvasından ayrı salmaq. *Xanimanımdan məni saldı, Nəbati, dərbədər; Əqlə bax, Məcnun kimi biganələrdən küsmüşəm.* Ə.Nəbati. *Şikəstə Zakirin varı var idi; Xalq içində etibarı var idi; Əbəs-əbəs saldı dərbədər, gözəl.* Q.Zakir.

**DƏRBƏND** *is.* [*fars.*] 1. *köhn.* Dağlarda dar keçid, dağ keçidi; dərə.

2. İranda dar küçə. *Onlar axşam saat ona iyirmi beş dəqiqə qalmış Qaraçılar dərbəndində olur.* M.S.Ordubadi. *Təbrizdə Müctəhid dərbəndinə getmək istəyən adam əvvəlcə böyük bir darvazaya rast gəlir.* P.Makulu.

◊ **Dərbənd olmaq** – meyl etmək, can atmaq, bənd olmaq. *Üçyaşar at açılan kimi, nə südə dərbənd oldu, nə də yoncaya, düz özün atdı arpanın üstünə.* (Nağıl).

**DƏRBƏNDİ** *is.* [Dərbənd şəhərinin adından] 1. İrigiləli kəmşirin üzüm növü. *Dərbəndidən doşab olmaz.*

2. Azərbaycan oyun havalarından birinin adı. *Dərbəndi oynamaq.*

**DƏRBƏRƏ** *is.* Böyük darvazalardakı kiçik qapı.

**DƏRBƏSTƏ** *sif.* [*fars.*] 1. Qapısı bağlı.

2. *is.* Bağlı qapı.

3. *sif.* Xudmani.

**DƏRC** [*ər.*]: **dərc edilmək (olunmaq)** – qəzetdə, ya məcmuədə çap edilmək (olunmaq). *Qəzetdə Fərman haqqında bir məqalə dərc olunmuşdu.* Ə.Sadıq. **Dərc etdirmək** – qəzetdə, ya məcmuədə çap etdirmək. *Məqaləni qəzetdə dərc etdirdi.* **Dərc etmək** – qəzetdə, ya məcmuədə çap etmək. *"Kəşkül" "Əkinçi"nin yolunu davam etdirərək, öz səhifələrində gerilik əleyhinə kəskin məqalələr dərc edirdi.* M.İbrahimov.

**DƏRD** *is.* [*fars.*] 1. Qəm, qüssə, kədər, ürək acısı, mənəvi əzab, əziyyət, iztirab. *Dərdini dərd bilənə söylə*. (Ata. sözü) *..Mahnı adamın bütün dərdini unutdurur..* M.Hüseyn. // Haqqında düşünmək lazım gələn, qayğıya səbəb olan şey; ürəyi incidən daxili sıxıntı; qayğı, qeyd. *Elə dərd var ki, dəxi onun qabağında səbir, hövsələ mümkün deyil..* C.Məmmədquluzadə. // Əndişə, fikir, qayğı. *Axşamın qaranlığı çökdükcə* [Telmanın] *dərdi, kədəri artır, onu qayğı alırdı.* S.Hüseyn. *Kimsə gəlinin dərdindən agah ola bilmir*. Çəmənzəminli.

2. Ağrı, bədən nasazlığı, xəstəlik, azar. *Dərdi olan dərman arar*. (Ata. sözü). [Əvvəlinci azarlı:] *Ax! Ax! ..Vallah, bilmirəm ki, bu nə dərddi ki, gəlib yapışıb yaxamdan*. C.Məmmədquluzadə. // Məc. mənada. *Zakirəm, sızlaram misli-əndəlib; Tapmayıb dərdimi, əl çəkdi təbib*. Q.Zakir.

3. *məc*. Ürəkdəki sözlər, gizli arzular; sirr, fikir, düşüncə, məqsəd. *Onun bircə dərdi var, o da mühəndis olmaq.*

4. Qarğış mənasında (bəzən "canına" sözü ilə). – *Sonra, Əsgər bəy, canına dərd buyururam*. N.Vəzirov. [Zeynal:] *Zəhər, boğma, dərd, azar!..* C.Cabbarlı.

◊ **Dərd almaq** – bir şeyin fikri ilə, qayğısı ilə məşğul olmaq, bir şeyin iztirabını çəkmək. *Hərçənd mən bir müəyyən söz demədim, çünki övrətimin dərdi məni elə almışdı ki, nə gələcəkdən və nə keçəcəkdən xəbərim var idi.* C.Məmmədquluzadə. **Dərd çəkmək** – 1) acı bir hadisəni daim xatırlayaraq çox kədərlənmək, qəm-qüssə etmək, ruhi iztirab çəkmək. *Yol kəsib haramılar; Dərd çəkir yaralılar.* (Bayatı). [Dərviş:] *Bir dərd çəkməkdən yarım dərd çəkmək yaxşıdır.* Ə.Haqverdiyev. [Zərqələmin] *..üzündəki kədər onun daxilən .. bir dərd çəkdiyini bildirirdi.* Ə.Sadıq; 2) bax **dərdini çəkmək**. *Ağa dərviş! Deyirlər, el dərdi çəkənin gözlərinə qan damar, mənim sənə rəhmim gəlir*. N.Vəzirov. **Dərd eləmək (etmək)** – 1) bax **dərd çəkmək;** 2) ürəyinə salmaq, bir şeyi özü üçün qayğı obyekti etmək. **Dərd əhli** – özü dərd çəkdiyi üçün başqasının dərdini bilən, onun dərdini başa düşən adam. *Vidadi, xəstəyəm, günlər sanaram; Dərd əhliyəm, qəm hərfini qanaram.* M.V.Vidadi. *Eşqdə bidərdlər eylər təəccüb halıma; Yoxsa bu kişvərdə bir dərd əhli yoxdur, ey əcəb!* S.Ə.Şirvani. *Özün bir dərd əhli, bir qədir bilən; Danışıban deyən, oynayıb-gülən.* Aşıq Pəri. **Dərd gəlmək** – bax **dərd olmaq**. **Dərd götürmək** – bax **dərd almaq**. *Məni dərd götürdü.* Mir Cəlal. **Dərd olmaq** – qayğı, fikir obyekti olmaq, hər zaman üzərində düşünülməsini tələb edən, həmişə narahat edən bir iş olmaq. *..Hər şey Pəri nənəyə dərd olmuşdu.* M.Hüseyn. **Dərd vermək** – dərdlənməsinə, kədərlənməsinə, mənəvi əzab və iztirab çəkməsinə səbəb olmaq. *Gəlişin ruhuma dərd verir, aman! Məhəbbət dəmidir, bahar, ay bahar!* S.Vurğun. **Dərd yarıdır** – bir şeyin lazım olduğundan daha az, arzu edildiyindən daha pis olduğunu göstərən ifadə. *Vahid, heç olmasa, dərd yarıdır, aləmdə yenə; Bizə rəhm eyləsə mindən biri cananələrin.* Ə.Vahid. **Dərdə batmaq** – bir şeyin fikri, qayğısı ilə məşğul olmaq, bir şeyi özünə dərd etmək. *Bu gecə Kosa dünyanın dərdinə batdığı halda, .. pişik kefə batmışdı.* S.Rəhimov. **Dərdə düşmək** – 1) (bəzən "canı" sözü ilə) xəstələnmək, bir xəstəliyə tutulmaq; 2) bir şeyi özünə dərd etmək. *Mən düşən dərdə düşsə; Mum olur, dağ da ərir.* (Bayatı). *Cahanda düşdünsə min qəmə, dərdə; Qaranlıq çəkmədi gözünə pərdə..* S.Vurğun. **Dərdə giriftar etmək, dərdə salmaq** – dərdə düçar eləmək, dərdə salmaq, dərdlənməsinə səbəb olmaq. *Oğlanı dərdə salan; Bir alagöz gəlindir.* (Bayatı). *Çəkərsən boynuna pərdə; Salarsan aşiqi dərdə.* Q.Zakir. *Nə sən fəraqə səbəb olmusan, nə mən bais; Bu dərdə saldı bizi*

*ruzigar, ey dust!* S.Ə.Şirvani. **Dərd(in)ə qalmaq** – birinin dərdini, fikrini çəkmək, birinin qeydinə qalmaq, haqqında düşünmək. *Əsrlərdən bəri, illərdən bəri; Dərdinə qaldığım yerdir bu yerlər.* M.Müşfiq. **Dərdindən dəli (dəli-divanə) olmaq** – b a x **dərdindən ölmək**. **Dərdindən ölmək** – 1) itirmiş olduğu ən əziz bir şeyi daim düşünmək, xatırlamaq və dərin iztirab nəticəsində özünü tələf etmək; 2) *məc.* son dərəcə sevmək, dəlicəsinə sevmək. *Şərbaf Qasıma, bəzzaz Ağa Qənbərə getmir; Dərdindən ölür, Molla Ələsgərə də getmir.* Ə.Nəzmi; // Son dərəcə qeydinə qalmaq, fikrini çəkmək, qayğısını çəkmək, maraqlanmaq. **Dərdinə dərman (çarə) eyləmək (etmək, olmaq)** – birini düşmüş olduğu ağır vəziyyətdən, iztirabdan, qayğıdan, dərddən qurtarmaq üçün çarə tapmaq. *A kişi .. xəbərin yoxmu, dövlət dumasından da dərdlərimizə bir dərman olmadı, duma özü də dağıldı!* N.Vəzirov. *Çərkəz dostunun da həyəcan keçirəcəyini, bu xəbəri eşidən kimi əl-ayağa düşəcəyini və onun dərdinə şərik olacağını gözləyirdi.* İ.Şıxlı. **Dərdinə qalmaq** – b a x **dərdinə yanmaq**. **Dərdinə şərik olmaq** – birinin dərdini yüngülləşdirmək üçün ona təsəlli vermək, hüsn-təvəccöh göstərmək, onunla bərabər kədərlənmək. *Çərkəz dostunun da həyəcan keçirəcəyini, bu xəbəri eşidən kimi əl-ayağa düşəcəyini və onun dərdinə şərik olacağını gözləyirdi.* İ.Şıxlı. **Dərdinə yanmaq** – yazığı gəlmək, halına acımaq. **Dərdini açmaq (açıb tökmək)** – sirrini, ürəyindəkiləri açıb söyləmək. [Firidundan] *savayı heç kəsə dərdimi açmaram.* Ə.Haqverdiyev. [Zeynalın] *keçən gün əli hər şeydən üzülüb öz dərdini Şərifzadəyə açıb söyləmişdi.* S.Hüseyn. *Kosa dərdini açmaq, məsləhət almaq üçün bir ürək sirdaşı axtarırdı.* S.Rəhimov. **Dərdini çəkmək** – bir şeyin, yaxud başqasının fikrini, qayğısını çəkmək. [Sevinc:] *Qaşqay, niyə belə kefsizsən? Yoxsa, dostunun dərdini çəkirsən?* Z.Xəlil. **Dərdini dağıtmaq** – fikrini, zehnini məşğul edən bir qayğını, kədəri, qüssəni, qəmi özündən uzaqlaşdırmaq. [Cahandar ağa] .. *bütün günü hirsli-hirsli meşədə gəzmiş, dərdini dağıdıb, başını qatmaq üçün qabağına çıxan quşlara, vəhşi donuzlara güllə atmışdı.* İ.Şıxlı. **Dərdini təzələmək** – yaddan çıxmış acı bir hadisəni yadına salaraq ruhi iztirab vermək, dərdləndirmək, kədərləndirmək.

**DƏRD(İ)-HAL** *is.* [*fars.* dərd və *ər.* hal] *klas.* b a x **dərd** 3-cü mənada. *Kənarda durmaqla millətin ehtiyacını və dərd-halını bilmək olmaz.* F.Köçərli.

**DƏRD(İ)-SƏR** *is.* [*fars.*] *klas.* Başağrısı, əziyyət, narahatlıq; qayğı, qeyd. *Ey xuda, kim çəkər axırda gülabın bu gülün; Dərdisər dəfinə aləmdə bu dərman gülüdür.* S.Ə.Şirvani. // Dərd-qəm, qayğı, fikir. *..Başıma dolanan, dərd-sərimi dağıdan, viran könlümü gülüstan edən Ruqiyyə idi, Ruqiyyə.* A.Divanbəyoğlu. □ **Dərd(i)-sər çəkmək** – narahatçılıq çəkmək, narahat olmaq. *Biz almışıq arvad, olaq bəxtəvər; Almamışıq, gündə çəkək dərdi-sər.* Ə.Nəzmi. [Çimnaz:] *..Baxanda deyirsən ki, dərd-sər çəkməyir,* [Sona] *arsızdır...* Ə.Əbülhəsən. **Dərd(i)-sər vermək** – başağrısı vermək, əziyyət vermək, narahat etmək. *..Axır bu dəlixana söhbəti nə bir söhbətdi ki, bunun üstə özünüzə də, bizə də bu qədər dərd-sər verirsiniz?* C.Məmmədquluzadə. *Bir nəfər havadar və qəmxarım yoxdur, yenə sizə ümidvar olub da, dərd-sər verməyə cəsarət edirəm.* M.Ə.Sabir.

**DƏRD(Ü)-MÖHNƏT** *is.* [*fars.* dərd və *ər.* möhnət] b a x **dərd-qəm**.

**DƏRD-BƏLA** *is.* [*fars.*] Dərdə, qayğıya səbəb olan hal; iztirab və əziyyət verən və ya qorxulu hadisə. *Dərd-bəladan qurtarmaq.* // Xəstəlik mənasında. *Yol ötdüm, çıxdım yala; Nahaqdan düşdüm qala; Əyil üzündən öpüm; Candan çıxsın dərd-bəla.* (Bayatı).

**DƏRDBİLƏN** *is.* Başqasının dərdini, kədərini, ürək sirrini duyan, başa düşən, ona acıyan və kömək edən adam. *Dərdini dərdbilənə söylə.* (Ata. sözü). *Sənə Vaqif kimi dərdbilən gərək; Layiq görməm hər nadanı mən sənə.* M.P.Vaqif. *Vilayətdə gözəl çoxdu, nə fayda; Dərdbilən, yetən dadə tapılmaz.* Q.Zakir.

**DƏRDBİLMƏZ** *is.* Başqasının dərdini, halını düşünməyən, ona acımayan, kömək etməyən adam. *Dərdbilməzlər qanar məni, heç bilməz; Dərd ilə doludur döşüm, ağlaram.* Q.Zakir.

**DƏRD-DİL** *is.* [*fars.*] *köhn.* Ürək dərdi, sirr. *Məşədi Qasım mənim qonşumdur, dərd-dilini mənə söyləyib.* C.Məmmədquluzadə.

**DƏRDƏCƏR** *sif.* Azarlı, dərdli, xəstə, nasaz, zəif. *Dərdəcər adam. Dərdəcər uşaq.* ☐ **Dərdəcər olmaq** – dərdə düşmək, azara düşmək. *Mehdi tutulandan sonra Nəbi ya dərdəcər olub öləcək, ya da üzə çıxacaqdır.* "Qaçaq Nəbi". [Hacı Qara:] *Durub gedim evə, tədarükümü görüm, .. yoxsa qüssədən dərdəcər ollam.* M.F.Axundzadə. [Cənnətəli:] *Vallah, az qalmışam dərdəcər olum.* N.Vəzirov.

**DƏRD-ƏLƏM** [*fars.* dərd və *ər.* ələm] bax **dərd-qəm**. *Həmdəmimdi bu dərd-ələm: Öz içimdə öz zəlzələm; Ayıqca yatır, ay Allah!* M.Araz.

**DƏRD-ƏLƏMLİ** bax **dərd-qəmli**.

**DƏRDƏSƏR** *is.* [*fars.*] Başağrısı, dərd, qayğı.

**DƏRDƏSƏRLİ** *sif.* Çoxlu dərdi, qayğısı olan; başıbəlalı, dərdli.

**DƏRDƏST** [*fars.*]: **dərdəst etmək** *köhn.* – tutmaq, ələ keçirmək, yaxalamaq, həbs etmək. *Caniləri dərdəst etdilər. – Keçəmirli kəndindən məxfi məktub yazıb onu dərdəst edəcəklər.* Mir Cəlal.

**DƏRD-ƏZAB** *is.* [*fars.* dərd və *ər.* əzab] bax **dərd-qəm**.

**DƏRD-ƏZABLI** *sif.* Əziyyətli, əzablı, əzab və əziyyətlə dolu.

**DƏRDİ-DİL** bax **dərd-dil**. *Qasid gəlcək, dərdi-dilin bilmişəm; Möhnətilə didəm yaşın silmişəm.* Aşıq Pəri.

**DƏRDİMƏND** bax **dərdmənd**.

**DƏRDİRİLMƏ** "Dərdirilmək"dən *f.is.*

**DƏRDİRİLMƏK** "Dərdirmək"dən *məch.*

**DƏRDİRMƏ** "Dərdirmək"dən *f.is.*

**DƏRDİRMƏK** "Dərmək"dən *icb. Almaları dərdirmək.*

**DƏRDKEŞ** *is.* [*fars.*] Dərd çəkən, dərdi olan; dərdli. *Olma xali dərdkeşlər söhbətindən, ey könül!* Füzuli.

**DƏRD-KƏDƏR** bax **dərd-qəm**.

**DƏRD-QƏM** *is.* [*fars.*] Qəm, qüssə, kədər. *Gülsümün yükü və dərd-qəmi gündən-günə artmaqda idi.* Ə.Haqverdiyev.

**DƏRD-QƏMLİ** *sif.* Qəmli, qüssəli, kədərli.

**DƏRD-QÜSSƏ** *is.* [*fars.* dərd və *ər.* qüssə] bax **dərd-qəm**. *Laləzar çəmənlərində, soyuq bulaqlarında, layla çalan meşələrində bir qarış yer yoxdur ki, balaların orada şad olub dərd-qüssəyə düçar olmasınlar.* N.Vəzirov.

**DƏRD-QÜSSƏLİ** bax **dərd-qəmli**.

**DƏRDLƏNDİRİCİ** *sif.* Dərdlənməyə, kədərlənməyə, iztirab çəkməyə səbəb olan, dərd artıran; dərdverici.

**DƏRDLƏNDİRMƏ** "Dərdləndirmək"dən *f.is.*

**DƏRDLƏNDİRMƏK** bax **dərdlətmək**.

**DƏRDLƏNMƏ** "Dərdlənmək"dən *f.is.*

**DƏRDLƏNMƏK** *f.* 1. Kədərlənmək, xiffətlənmək, dərdə düşmək, dərd çəkmək. *Mən də dərdlənmişəm küskün səsindən; Bir əsrin o qanlı faciəsindən..* S.Vurğun. *Dərdlənən o qoca, qanlı, amansız; Dalğanda yox olan oğlunu istər.* R.Rza.

2. *məc. dan. vulq*. Acgözlüklə yemək.

**DƏRDLƏŞMƏ** "Dərdləşmək"dən *f.is.*

**DƏRDLƏŞMƏK** *qarş.* Dərdlərini bir-birinə söyləmək; ümumiyyətlə, baş-başa verib söhbət etmək. [Soltan bəy:] *Daha bundan gözəl nə olmuş ola. Əcəb söhbət eyləyirik. Sən dul, mən dul, gəl dərdləşək də!* Ü.Hacıbəyov. *Qoy götürüm ələ mən sədəfli saz; Sonra da dərdləşək səninlə bir az*. Ə.Cavad.

**DƏRDLƏTMƏ** "Dərdlətmək"dən *f.is.*

**DƏRDLƏTMƏK** *f.* Dərdə salmaq, dərdləndirmək.

**DƏRDLİ** *sif.* 1. Dərdi, kədəri olan. *Mehriban dərdli başını məzlumanə bir tərzdə qaldırıb yaşı yanaqlarına doğru axan gözləri ilə baxdıqda Səlimi gördü.* S.Hüseyn. *Bizim dərdli Rəna, bir də ki Əsmət; Gəldi aparmağa nakam Güləri.* M.Rahim. // Hüzn gətirən; həzin, kədərli, qüssəli, ələmli, yanıqlı. *Aşiqin dərdli mahnıları. – Mən bilməz idim, bəla imiş eşq; Bir dərdli macəra imiş eşq.* Füzuli. *Mən səni görmüşəm on beş il əzəl; Dilində bir qoşma, bir dərdli qəzəl.* S.Vurğun. // İs. mənasında. *Dərdli söylədiyini dəli söyləməz.* (Ata. sözü). *Gecə uzun, ay batmaz; Dərdlilər gecə yatmaz.* (Bayatı).

2. Xəstəliyi, illəti olan; əlil, məriz.

**dərdli-dərdli** *zərf* Qəmli, qüssəli, dərdli halda, qəmgin-qəmgin, yanıqlı-yanıqlı.

*Bəzən dərdli-dərdli yaşmaq altından; Solğun baxışınla sakit baxırsan.* Ə.Cavad. [Səlim] *qapının ağzında dik dayanır, dərdli-dərdli ağlayır, buradaca mürgüləyirdi.* S.Rəhimov.

**DƏRDLİLİK** *is.* Dərdli adamın halı, ürəyində dərd olma.

**DƏRDMƏND** *is.* və *sif.* [*fars.*] *klas.* 1. Dərdi, kədəri olan, ürəyi dərdli. *Saqi, məməd et ki, dərdməndəm; Qəm silsiləsinə paybəndəm.* Füzuli. *Gözlə məni, zarü dərdməndəm; Zənciri-xumarə paybəndəm.* Məsihi.

2. Başqasının qeydinə qalan, başqasının dərdinə qalan. // *məc. zar.* Hal əhli. *Görünür ki, qazı lotudu və yaxşı adamdı, .. görünür ki, dərdmənddi.* C.Məmmədquluzadə.

**DƏRDNAK** *sif.* və *zərf* [*fars.*] 1. *klas.* Dərdli, kədərli, qüssəli, ələmli. *Dərdnak könül. – Qeys onu görüb həlak oldu; Min şövq ilə dərdnak oldu.* Füzuli. *Gördü yazılan kəlam pakin; Oxudu hədis dərdnakin.* Məsihi.

2. Azarlı, xəstə.

**DƏRDSİZ** *sif.* və *is.* Heç bir dərdi, qayğısı olmayan. *Dərdsiz adam. Çaylar daşdı, çağladı; Dərd üstdən dərd bağladı; Getdim dərdsiz yanına; O məndən çox ağladı.* (Bayatı).

**DƏRDSİZ-QƏMSİZ** *sif.* Dərdi, qayğısı olmayan. *Ömrün-günün dərdsiz-qəmsiz deyildi; Çox ananın dərdi sənə deyildi.* M.Araz.

**DƏRDSİZLİK** *is.* Heç bir dərd olmadığı hal.

**DƏRDÜ-BƏLA** b a x **dərd-bəla**. *Ey qan olan könül, niyə düşdün bu halə sən? Bais nədir bu dərdü-bəlayə həvaləsən?* S.Ə.Şirvani.

**DƏRDÜ-QƏM** b a x **dərd-qəm**. *Aləmin dərdü-qəmindən xəbərin yox, Seyyid! Mən ki meyxanəni illərdi pənah eyləmişəm.* S.Ə.Şirvani.

**DƏRDÜ-QÜSSƏ** *klas.* b a x **dərd-qüssə.**

**DƏRDÜ-MÖHNƏT** *klas.* b a x **dərd(ü)-möhnət**. *Ömür keçdi, insaf eylə, sevdiyim; Nə müddətdi dərdü-möhnət çəkirəm.* Q.Zakir. *Sivayi-dərdü-möhnət fəqr mülkündən xəracim yox.* S.Ə.Şirvani.

**DƏRDVERİCİ** b a x **dərdləndirici**.

**DƏRƏ** *is.* 1. İki dağ və ya təpə arasında, eləcə də düzənlikdə uzun dərin çuxur; vadi. *Ey söyüdlü dərə, ey dumanlı dağ; Səfaya daldığım yerdir bu yerlər.* M.Müşfiq.

2. Çay yatağı, çayın axdığı yer. *Çəmənin üst tərəfi getdikcə uca, qarlı dağlara müttəsil olur və qabağında bir dərə var, içindən bir balaca çay axır.* M.F.Axundzadə. *Çöllər, dərələr dürlü çiçəklərlə bəzəndi; Dağdan, qayadan qar əridi, çaylara endi.* A.Səhhət.

◊ **Dərə xəlvət, tülkü bəy** (Ata. sözü) – hərki-hərkilik, özbaşınalıq olan yer haqqında.

**DƏRƏBƏY(İ)** *is. tar.* Keçmiş zamanlarda bir neçə kənd üzərində hökmü olan iri torpaq sahibi. // Feodal. *Hər şeydən əvvəl, Mirzə Fətəlini köhnə Şərq dövlət idarəsi üsulunun tənqidçisi, monarxizmin, İran istibdad və dərəbəy üsulunun amansız bir düşməni kimi görürük.* C.Cabbarlı.

**DƏRƏBƏY(İ)LİK** *is.* 1. *tar.* Dərəbəyinin hal və vəziyyəti. // Feodallıq, feodalizm. *Dərəbəylik dövrü. Dərəbəylik dövrünün qalıqları.*

2. *məc.* Hərki-hərkilik, özbaşınalıq. *Ölkə dərəbəylik, – deyə xan-xanmı sanırsan? Axmaq kişi, insanlığı asanmı sanırsan?* M.Ə.Sabir. *Bilmirik ki, heç bu nə dərəbəylikdir?* S.Rəhimov. [Zeynal:] *..Amma səndən olsa, dünya qarışar, dərəbəylik olar.* Ə.Əbülhəsən.

**DƏRƏCƏ** *is.* [*ər.*] 1. Bir şeyin müqayisəli kəmiyyəti, səviyyəsi. *Mədəniyyət dərəcəsi. İnkişaf dərəcəsi. Bilik dərəcəsi. Təhsil dərəcəsi. – Kənd əhalisinin savad dərəcəsini inqilabdan əvvəlki ilə müqayisə etmək çox qəribə görünür.* İ.Əfəndiyev. // Bir sıra sözlərə qoşulduqda, həmin sözlə ifadə edilən şeyin həddini, qədərini, əhəmiyyətini bildirir. *Son dərəcə* (ifrat bildirir). *Mühüm dərəcədə* (çox, olduqca). *Eyni dərəcədə* (bərabərlik bildirir). *Bir dərəcəyə qədər* (qismən, bir cəhətdən). – *Qətibə öz fikrində ifrat dərəcəsinə çatmışdı.* M.S.Ordubadi. *Günəş, hərarəti təsir etməyəcək dərəcədə üfüqə doğru enmişdi.* S.Hüseyn. *Dilbər anasının bu nəzərlərində onun şikayətini və bir dərəcəyə qədər yalvarışını oxuyurdu.* Ə.Sadıq. // Hədd. *Rüstəm kişinin amiranə səsi və dərəcəsini aşan sərbəst hərəkəti Qoşatxanın xoşuna gəlmədi.* M.İbrahimov. // *yerlik halında*. Qədər. *O dərəcədə. Bu dərəcədə isti görməmişəm. Mümkün dərəcədə. – Osmanlıda qanuni-əsasi arvadları o də-*

*rəcədə şövqə gətirib ki, daxi gözləri naməhrəm kişiləri görmür.* C.Məmmədquluzadə. *..Ağa dərviş, mənim sözlərimin bu dərəcədə səni pərt edəcəyini bilsəydim, əlbəttə, onları ağzıma almazdım.* A.Divanbəyoğlu.

2. Elmi ad, rütbə. *Elmlər namizədi dərəcəsi. Doktorluq dərəcəsi.*

3. İdmanda: qrup, kateqoriya, pillə. *Şahmatda ikinci dərəcə almaq. İdmançının çəki dərəcəsi. – Boks, güləşmə, ağırlıq qaldırma kimi idman növləri sahəsində idmançılar öz çəkilərinə görə dərəcələrə ayrılırlar.* Ə.Babayev.

4. *riyaz.* Dairənin $^1/_{360}$ hissəsinə bərabər bucaq və ya qövs ölçüsü vahidi. *Hər insan bir peykdi məncə; Doxsan peyk yüz səksən dərəcə; Mehvərindən dönüb getdi.* M.Araz.

5. *fiz.* Termometr, barometr və b. ölçü cihazları üzərindəki bölgü. *Temperaturun ölçü vahidi dərəcədir. İyirmi dərəcə şaxta. Otuz dərəcə isti. – Yasəmənin qızdırması getdikcə artırdı. Səhər açıldıqda hərarəti qırx dərəcəyə çatdı.* S.S.Axundov. [Murad:] *Vəli xəstələnib, qırx dərəcə qızdırma içində yatır...* S.Rəhman.

6. Vəzifə, mövqe, rütbə, mərtəbə. *Dərəcəsi yüksəlmək.* – [Vəzir:] *..Heç bilirsənmi ki, sənin bacını xana vermək ilə nə qədər mənim dərəcəm və sənin rütbən artıq olacaqdır?* M.F.Axundzadə.

**DƏRƏCƏLƏMƏ** “Dərəcələmək”dən *f.is.*

**DƏRƏCƏLƏMƏK** *f.* Dərəcələrə bölmək.

**DƏRƏCƏLƏNMƏ** “Dərəcələnmək”dən *f.is.*

**DƏRƏCƏLƏNMƏK** *məch.* Dərəcələrə bölünmək.

**DƏRƏCƏLİ** *sif.* 1. Dərəcəsi olan, dərəcə almış, dərəcəyə malik olan. *Dərəcəli elmi işçi. Dərəcəli idmançıların sayı getdikcə artır.* // Adətən sıra saylarından sonra. *İkinci dərəcəli diplom. İkinci dərəcəli məsələ. Birinci dərəcəli rol oynamaq.*

2. Dərəcələrə bölünmüş.

**DƏRƏCƏSİZ** *sif.* Dərəcəsi olmayan. *Dərəcəsiz elmi işçi. Dərəcəsiz idmançı.*

**DƏRƏCİK** *is.* Kiçik dərə. *Dərəcikdə gecələmək. – Zığlı dərəciklər .. yaşıllaşırdı.* M.İbrahimov.

**DƏRƏK** *is.* [*ər.*] 1. *köhn.* Uçurumun dibi.

2. Aşağı dərəcə, aşağı pillə.

3. Cəhənnəm, cəhənnəmin dibi.

**DƏRƏLİK** *is.* Dərələr olan yer. // Sif. mənasında. *..Uçurum, dərəlik, sıldırım qayalıq yerlərdən keçirdim.* A.Şaiq.

**DƏRƏLİK-TƏPƏLİK** b a x **dərə-təpəlik**.

**DƏRƏLİ-TƏPƏLİ** b a x **dərə-təpəli**. *Dərəli-təpəli səhralar.* – [Zöhrab] *Gözünü Kürə, meşəyə, Ceyran çölün son bahar yaşıllığına bürünmüş dərəli-təpəli çöllərinə zillədi.* İ.Şıxlı.

**DƏRƏMUM** *is.* Təmizlənməmiş mum; qaramum.

**DƏRƏ-TƏPƏ** *is.* Dərəli-təpəli yer, düz olmayan yer. [Cahangir bəy:] *Onda dərə-təpələr dolardı qaçaqla.* N.Vəzirov. [Kosaoğlu:] *Deyəsən, İmran da ona uyub. Öz işgücünü bir yana buraxıb, dərə-təpə gəzir.* İ.Şıxlı.

◊ **Dərədən-təpədən** – oradan-buradan, adda-budda.

**DƏRƏ-TƏPƏLİ** *sif.* Dərə-təpəsi çox olan, düz olmayan. *Dərə-təpəli sahələr.*

**DƏRƏ-TƏPƏLİK** *is.* Dərə və təpələr olan yer. *Vaxtı ilə çılpaq dərə-təpəlik o yuxarı dağlıq hissə indi gül-çiçəyə bəzənmişdir.* (Qəzetlərdən).

**DƏRGAH, DƏRGƏH** *is.* [*fars.*] *klas.* 1. Astana, kandar, qapı önü; böyük adamların qapısı; saray, iqamətgah. [Xaqani:] *Nizami! Lütf ilə soruşsan nəyəm? Sənin dərgahında aciz bəndəyəm.* M.Rahim.

2. *məc. din.* Allahın mərhəməti, şəfqəti, köməyi, inayəti mənasında (bəzən “Allah”, “həqq” sözləri ilə). *Yarəb, kərəm et ki, xarü zarəm; Dərgahə bəsi ümidvarəm.* Füzuli. *..Həmşəriləri təziyə məclisinə .. qoymayanda .. başlarını salardılar aşağa və öz-özlərinə deyərdilər: – Allah, şükür dərgahına!* C.Məmmədquluzadə. *Xəlifə onların hər birinə tək-tək cavab verib, onlar üçün Allah dərgahından səadət və dövlət rica edəcəyini və duasını onların barəsində şamil edəcəyini vədə verdi.* M.S.Ordubadi. ☐ **Əllərini Allah dərgahına qaldırmaq (qalxızmaq)** – Allaha müraciətlə əllərini göyə qaldırıb ona yalvarmaq, raz-niyaz etmək. [Sona xanım:] *Əziz Allah, dərgahına qalxızmışam əllərimi!* Ə.Haqverdiyev.

3. *məc. tənt.* Ev. *Peymanını pozan xəyal həmdəmim; Dərgahıma sayə salmayacaqdır.* S.Vurğun.

**DƏRHAL** *zərf* [*fars.* dər və *ər.* hal] O saat, tez, əlüstü, fövrən, gecikmədən. *Hamı dərhal ayağa qalxdı. – Qanadların qayaya çırparaq uçar qartal; Dikib yerə gözünü ov üçün baxar dərhal.* A.Şaiq. *Nurəddinin özü də şad oldu və dərhal heybəsini götürüb cəld getdi.* S.S.Axundov.

**DƏRHƏQİQƏT** *zərf* [*fars.* dər və *ər.* həqiqət] *köhn.* Doğrusu, doğrudan da, həqiqətdə, həqiqətən.

**DƏRİ** *is.* 1. İnsan və heyvanın bədəninin üstünü örtən mikroskopik məsaməli ət örtüyü. *Qolumun dərisi soyulub. Dərisi səpmək. – Qulunun başının tükləri, qaşları və kirpikləri xına rəngində idi. Hətta dərisi belə kürənə çalırdı.* M.İbrahimov.

2. Heyvanın tüklə örtülü dərisi. *Qoyun dərisi. Tülkü dərisi. – Pələngin dərisini soyub evə dönərkən qonşular başıma toplandı.* A.Şaiq. // Xəz. *Dəri yaxalıqlı palto*.

3. Gön. *Özümüz üçün lazım olan paltar və ayaqqabı hazırlamaqdan ötrü heyvanlardan yun, xəz, dəri* (*gön*) *əldə edirik.*

4. Pendir, yağ və s. saxlamaq üçün qoyun və keçi dərisindən xüsusi üsulla hazırlanan motal. *..Bir tərəfdə un çuvalları düzülüb, bir tərəfdə də yağ diriləri, yun məfrəşləri qoyulubdur.* M.F.Axundzadə. *Kərə yağı göndər mənə bir dəri.* M.Möcüz.

5. Dəridən qayrılmış, dəridən düzəldilmiş, dəridən tikilmiş. *Dəri palto. Dəri yaxalıq. Dəri ayaqqabı. Dəri cild. – ...Almurad baba .. dəri qından bir qəmə çıxarıb satıla çəkdi.* İ.Əfəndiyev.

6. Meyvənin qabığı.

◊ **Bir dəri, bir sümük** – son dərəcə arıq, sısqa, zəif adam haqqında. *Çəngələdi qocanı yatağından qaldırdı, bir dəri bir sümük idi, evi başına uçmuş bir quş müqəvvası kimi yüp-yüngüldü.* Ə.Məmmədxanlı. **Dəridən çıxmaq** – 1) həddindən artıq çalışmaq, əlləşmək, əlləşib-çapalamaq. [Əhməd] *Biri gecə-gündüz dəridən çıxıb işləyir, o biri at belində gəzir.* İ.Şıxlı; 2) çoxlu zəhmət, pul, mal sərf etmək. **Dəridən-dırnaqdan çıxmaq** – b a x **dəridən çıxmaq** 1-ci mənada. *Qurbanəli bəylər çar məmurlarına xoş gəlmək üçün dəridən-dırnaqdan çıxırdılar.* M.İbrahimov. **Dərisi üstündə yanmaq** – arıqlamaq, qurumaq. *İşləməkdən dərisi üstündə yanıb.* **Dərisinə saman təpmək** – çox əziyyət vermək, çox incitmək, divan tutmaq; öldürmək. – *Məgər qorxmayırsan onun qohum-əqrəbasından? Dərinə saman təpərlər, axı!* N.Vəzirov. *Görək, kim kimin dərisinə saman təpəcək.* Ə.Əbülhəsən. **Dərisinə sığmamaq** – 1) son dərəcə kökəlmək; 2) kibrlənmək, çox təşəxxüslənmək, öyünmək. **Dərisini soymaq** *məc.* – bərk cəzalandırmaq, cəza vermək, divan tutmaq. [Aslan bəy:] *Tarverdi, get, uşaqlara söylə ki, odun yığıb o qayanın başında bir çıraqban etsinlər ki, bütün mahal işığını görməsə, dərilərin soyaram.* C.Cabbarlı. **Dərisini sudan çıxarmaq** – birtəhər canını qurtarmaq. **Quru dəri** – çox arıq, çox zəif adam haqqında. *Aşiqin məşuqu gərək çağ olsun; Nə hasil o quru dəridən sənə*. Q.Zakir.

**DƏRİALTI** *is. anat.* Dərinin altında olan. *Dərialtı toxumalar. Dərialtı piy təbəqəsi*.

**DƏRİAŞILAYAN** *is.* Xam dəriləri aşılamaqla məşğul olan usta.

**DƏRİBİÇƏN** *is.* Dəridən ayaqqabı, paltar və s. biçən usta. // Sif. mənasında. *Dəribiçən qayçı*.

**DƏRİBOYAYAN** *is.* Dəriləri müxtəlif rənglərdə boyayan usta. // Sif. mənasında. *Dəriboyayan alət*.

**DƏRİCİK** *is*. Kiçik dəri, incə dəri, nazik dəri.

**DƏRİÇƏ** *is.* [*fars.*] 1. Kiçik qapı.

2. Divarda kiçik taxça. [Odabaşı:] *Divarlarda xırdaca dəriçələr var.* Ə.Haqverdiyev.

**DƏRİÇİ** *is.* Dəri istehsalı işçisi; dabbağ.

**DƏRİÇİLİK** *is.* Dəriçi sənəti; dabbağlıq.

**DƏRİXANA** *is.* Dəri emal edilən yer, karxana; dabbağxana. *Girəcəkdəki ikimərtəbə mülkün altı dərixanadır*.

**DƏRİLİ** *sif.* Dərisi olan. // Dəridən olan, üstü dəri ilə örtülü. *Mirzə Muxtar dükana qənd-çay almağa gedərdi. Həmişə damağında əyri qəlyan olardı, soyuq havada boynu qaragül dərili uzun paltonu çiyninə salardı.* İ.Məlikzadə.

**DƏRİLİK** *sif.* Xəzlik; dəri (xəz) hazırlamağa yarayan, dərisindən istifadə üçün

saxlanılan. *Dərilik qoyun cinsləri. – Dərilik cinslərdən başqa, tüklük cinslər də vardır. Bu cinslərdən olan adadovşanlarının tükü çox uzun və yumşaq olur.*

**DƏRİLMƏ** "Dərilmək"dən *f.is.*

**DƏRİLMƏK** "Dərmək"dən *məch*. *Meyvələr dərildi. – Dərildi bostanlar, boş qaldı tağlar; Könül istədiyin verməsən, ağlar.* Aşıq Abbas. *Zamanı çatmamış deyilən söz, kal dərilən meyvə kimidir, zərər gətirər.* M.İbrahimov.

**DƏRİN** *sif.* 1. Səthindən, yaxud ağzından dibinə qədər xeyli məsafə olan, böyük dərinliyi olan (*dayaz* əksi). *Dərin quyu. Dərin çay. Dərin göl. – Bu dərə, dərin dərə; Suları sərin dərə; Ovçu maral axtarır; Göstərmə yerin, dərə!* (Bayatı). // Dərində olan. *Dərin, darısqal dibində dərənin; Rəd kimi guruldayır baltalar.* A.Səhhət. *Bu saat dənizdə ən dərin buruq harada qazılır?* M.Hüseyn. // Dərindən çıxan. *Dərin su bulanmaz.* (Ata. sözü). // *is.* Dərin yer. *Balta çox dərinə getdi*. // *is.* Müəyyən dərinlikdə olan. *Dənizin* (*çayın*) *dərin yeri.* // Başqa özü kimilərə nisbətən daha çox dərinliyi olan. *Dərin boşqab. Alnında dərin qırışıqlar var.* // *Zərf mənasında.* Dərindən. *Dərin qazımaq. – Yer hamarlanır, traktorlar dərin şum eləyirdi.* Ə.Vəliyev. // Çox dərinlikdə olan, çox dərində yerləşən, çox dərinə girən. *Ağacın dərin kökləri. Dərin süxurlar.* // Çuxur, çuxurda olan. // Dərindən gələn (çıxan, eşidilən). *Dərədə dərin bir uğultu vardı.* M.Hüseyn. // İçəriyə doğru xeyli dərinliyi olan, xeyli içəriyə girmiş. *Dərin taxça. Ağacda dərin oyuq.*

2. Çox uzaqlara gedən, çox uzaqlarda olan, gözlə görünə bilən, hüdudu olmayan. *Hava dəryası dərin olduqca, onun ağırlığı da artıq olur*. H.Zərdabi. // *məc*. İntəhasız, sonsuz, ucsuz-bucaqsız. [Uluğ:] *..Eşqdir çalxanan köpüklü dəniz; Ya fəzadır dərin və sahilsiz.* A.Şaiq. // Uzaq, uzaqda olan. *Meşənin dərin küncündə cəh-cəh ilə oxuyan bülbüllərə qulaq verdim.* A.Divanbəyoğlu. *Maşınımız artıq gurultu və atışma səslərindən uzaqda, demək olar ki, dərin arxada idi.* Mir Cəlal. // *is*. (cəm şəklində). Uzaq yerlər, uzaqlar; əlçatmaz, görünməz, tənha yerlər. *Meşənin vahimələri özlərini daha dərinlərə, xəlvətlərə çəkirdi.* S.Rəhimov.

3. *məc*. Çox məzmunlu, çox mənalı, əsaslı, əhəmiyyətli, ciddi; çox ağıllı, çox düşünmək tələb edən. *Dərin söz. Dərin fikir. Dərin məlumat. Dərin təhlil. Dərin məna. Dərin əsər. – Bu dərin məanini gör, nə bəyan qılır Nəsimi; Fələkin dili tutuldu bu ulu bəyan içində.* Nəsimi. [Dəli Səmədin] *simasında dərin bir fikir, ya yüngül və şirin xəyalat oxunurdu.* Çəmənzəminli. // Çox bilikli, çox məlumatlı, elmli, dünyagörüşü geniş olan. *Çox yazmaq qəzetçi peşəsidir, çox kitab oxumaq .. dərin həkimlərin sənətidir.* C.Məmmədquluzadə.

4. *məc*. Çox güclü, yüksək dərəcəyə çatmış, çox təsirli. *Elə bil ki, Cəlilin vücudu ancaq dərin yas, acı kədərdən yoğrulmuşdu.* S.Rəhimov. [Keşikçinin] *..iri, ala gözləri dərin bir səmimiyyətlə alışıb-yanırdı.* M.Hüseyn.

5. *məc*. Tam, heç bir şeylə pozulmayan. *Nənə dərin yuxusundan; Xeyli vaxtdır oyanmışdır*. M.Dilbazi. *Ortalığı dərin bir sükut qaplamışdı.* M.Hüseyn. *Məclis natiqin nə söyləyəcəyini gözləyərək dərin bir sükuta daldı.* Ə.Vəliyev.

◊ **Dərin(ə) getmək** – ifrata varmaq. *Ağa dərviş, çox dərin gedirsən, atam, mən bir yazıq, kasıb babayam, Allah xatirinə, məni bəlaya salarsan.* N.Vəzirov.

**dərin-dərin** 1) *sif.* çox dərin (çoxluq bildirir). *Dərin-dərin dənizlər. – Dərin-dərin dəryaları boyladı; Xəncər alıb qara bağrım teylədi.* Qurbani; 2) *zərf* dərindən. *Dərin-dərin sızlamaq. – Böyükxanım da Münəvvərin əlbəsə və qiyafəsini mülahizə edib, dərin-dərin düşünürdü.* M.S.Ordubadi.

**DƏRİNDƏN** *zərf* 1. İçdən, çox dərin. *Firidun ayağa durub köksünü ötürdü, dərindən nəfəs aldı.* M.İbrahimov. *Güllü dərindən qıy çəkdi*. Ə.Vəliyev.

2. Diqqətlə, fikrini cəmləşdirərək. *Həcər dərindən qulaq verib, güllə səsi eşitdi.* "Qaçaq Nəbi". // Əsaslı surətdə. *Sözün düzünü desək, Fərman ekskavatorçuluq həvəsinə düşəndə bu iş üçün əmlli-başlı, dərindən oxumaq lazım gələcəyini bilmirdi.* Ə.Sadıq.

3. Hərtərəfli, çox ciddi. *Dərindən düşünmək. – N.Nərimanovu, ehtimal ki, gənc Verterin iztirabları dərindən mütəəssir etmişdir.* M.Arif.

4. Çox, olduqca, son dərəcə. // Şiddətli, güclü. *Toplarımızın dərindən nərə çəkməsinə baxmayaraq, düşmən yerindən tərpənmirdi ..* Ə.Vəliyev.

**dərindən-dərin** *zərf* Çox dərin, çox ciddi, əsaslı surətdə. *Üç ilin gəlinidir; Bu incə, gözəl qadın; Bilir dərindən-dərin; Mənasını bu adın.* S.Rüstəm.

**DƏRİNDÜŞÜNCƏLİ** *sif.* Dərin düşüncəyə, güclü mühakiməyə malik; çox ağıllı, dərinfikirli, bəsirətli. *Dərindüşüncəli adam.*

**DƏRİNDÜŞÜNCƏLİLİK** *is.* Dərin düşünmə qabiliyyəti.

**DƏRİNFİKİRLİ** b a x **dərindüşüncəli**.

**DƏRİNFİKİRLİLİK** b a x **dərindüşüncəlilik**.

**DƏRİNLƏŞDİRİCİ** *sif. xüs.* Dərinləşdirən. *Dərinləşdirici maşın. – Kotana kotancıq və torpaq dərinləşdirici alətlər də quraşdırırlar.* “Pambıqçılıq”.

**DƏRİNLƏŞDİRİLMƏ** “Dərinləşdirilmək”dən *f.is.*

**DƏRİNLƏŞDİRİLMƏK** *məch.* Daha dərin hala salınmaq.

**DƏRİNLƏŞDİRMƏ** “Dərinləşdirmək”dən *f.is.*

**DƏRİNLƏŞDİRMƏK** *f.* 1. Daha dərin etmək, dərinliyini artırmaq. *Quyunu dərinləşdirmək. Çayı dərinləşdirmək.*

2. *məc.* Daha da şiddətləndirmək, daha da artırmaq (qüvvətləndirmək, ciddiləşdirmək, ağırlaşdırmaq). *Mübahisələri dərinləşdirmək. Ziddiyyəti dərinləşdirmək. – Rəşid .. ortaya nifaq toxumu saçır, ər ilə arvad arasında uçurumu dərinləşdirirdi.* S.Hüseyn. *Sərdar Rəşidin Təbrizdən yığışıb Tehrana getmək istəməsi mənim fəlakətimi daha da dərinləşdirdi.* M.S.Ordubadi.

**DƏRİNLƏŞMƏ** “Dərinləşmək”dən *f.is.* [Bənövşə:] *..Sevginin get-gedə dərinləşməsi və möhkəmlənməsi üçün bu bir parça metalın heç bir rolu yoxdur.* S.Rəhman.

**DƏRİNLƏŞMƏK** *f.* 1. Daha dərin olmaq, dərinliyi artmaq, daha da çuxurlaşmaq. *Çay xeyli dərinləşmişdir. Ortaya getdikcə dəniz dərinləşir.* // Dərinə (çuxura) düşmək. *Gözləri dərinləşmək.*

2. *məc.* Daha da ciddiləşmək, ağırlaşmaq, mürəkkəbləşmək, çətinləşmək. *Şamo dərin fikrə cumaraq: – Demək, belə?! – dedi, – məsələ dərinləşir.* S.Rəhimov.

**DƏRİNLƏTMƏ** “Dərinlətmək”dən *f.is.*

**DƏRİNLƏTMƏK** *f.* Dərin hala salmaq. *Çuxuru dərinlətmək. Dənizin dibini dərinlətmək.*

**DƏRİNLİK** *is.* 1. Bir şeyin, üzərindən ta dibinə, yaxud aşağıya doğru gedən istiqamətdəki nöqtəsinə qədər olan məsafə. *Quyunun dərinliyi 10 metrdir. – Həbib şumun dərinliyini yoxlayır, Mədəd Həbibin dediklərini bloknotuna qeyd edirdi.* Ə.Vəliyev. *Bu xəndək bir kilometr uzunluğu, qırx metr eni, otuz metr dərinliyi olan nəhəng bir dərədən ibarətdir.* Ə.Sadıq. // Dərin şeyin halı. *Dənizin dərinliyi. Gölün dərinliyi. Bu dərənin dərinliyi adamı qorxudur.* // Dərin qat, təbəqə mənasında.

2. Çox uzaqlıq, çox yüksəklik (intəhasızlıq) mənasında. *Hava yerin üzündə dəryada su duran kimi durubdur. Bu hava dəryasının dərinliyi 7-8 verstdən ziyadədir.* H.Zərdabi. *Çamırlı yerdən qalxan buxar dibsiz fəzanın dərinliklərinə uçub getdi.* M.Hüseyn. // İç, uzaq tərəflər, içərilər. *Rüstəm xeyli zaman çovğunla əlləşə-əlləşə meşənin dərinliyinə girdi.* S.Rəhimov.

3. *məc.* “Qəlbinin”, “ürəyinin” və s. sözlərlə – bir şəxsin daxili duyğuları, hissiyyatı, təəssüratı haqqında. *Uşaqlıqdan qəlbimin dərinliklərində iz salmış yekrəng olmayan o qiymətli və silinməz xatirələr!..* A.Şaiq. *Şair ən inadkar bir çocuq kimi; Endi xəyalının dərinliyinə...* S.Vurğun.

4. *məc.* Ciddilik, dərin mənalılıq, dərin məzmunluluq. *Fikrin dərinliyi. Əsərin məzmunca dərinliyi. – Dərinlik çox gözəldir; sadə olarsa; Nə çıxar o şeirdən, başımı yorsa?* M.Müşfiq.

◊ **Dərinlik nasosu** *tex.* – dərin neft quyularından neft çıxaran nasosların xüsusi növü. *Hazırda neft quyulardan üç üsulla çıxarılır; fontan, dərinlik nasosu, kompressor.* M.Məmmədli. *Dərinlik nasosu ilə istismar*

*zamanı bir çox hallarda quyuların təmizlənməsini təxirə salmaq mümkün olmur.*

**DƏRİNLİKÖLÇƏN** *sif. xüs.* Dərinliyi ölçməyə məxsus. *Dərinlikölçən cihaz.*

**DƏRİSİQARA** b a x **qaradərili**.

**DƏRİSİTİKANLILAR** *is. zool.* Dəniz kirpiləri, dəniz ulduzları və s.-ni əhatə edən onurğasız heyvanlar. *Dənizin dibində elə qəribə heyvanlar vardır ki, bunların nə sağ, nə də sol tərəfləri, nə baş və nə də quyruqları var, bunlar hər tərəfə sürünə bilir və hər bir tərəfə süründükdə irəli hərəkət edir. Bunlara dərisitikanlılar deyilir.* "Sualtı aləm".

**DƏRİSOYAN** *is.* 1. Heyvanların dərisini soymaqla məşğul olan işçi.

2. *məc. dan.* İnsafsız, bahaçı, istismarçı adam haqqında.

**DƏRİŞDİRMƏ** "Dərişdirmək"dən *f.is.*

**DƏRİŞDİRMƏK** *f.* Səliqə ilə yığmaq, düzmək. [Muzdur] *pulların üstündən ağ pal-paltarı öz tərtib və səliqəsi ilə bir-birinin üstünə dərişdirdi.* S.M.Qənizadə.

**DƏRİÜSTLÜYÜ** *is. anat.* Dərinin üst təbəqəsi.

**DƏRK** [*ər.*]: **dərk etmək** – anlamaq, başa düşmək, öz düşüncəsi ilə qavramaq. *Zeynal* [Şərifənin] *nələr dediyini və nə istədiyini eşidib dərk edə bilməyirdi.* S.Hüseyn. *Biz səadətin qədrini bildiyimiz kimi, qalibiyyətin məğrur sevincini də dərk etmişdik.* Ə.Məmmədxanlı; // obyektiv aləmin qanunauyğunluqlarını başa düşmək, əqlən qavramaq. *Təbiət və cəmiyyətin inkişaf qanunlarını dərk etmək. Hadisələrin mahiyyətini dərk etmək.*

**DƏRKAL** *is. məh.* Çətin keçilə bilən yer, dar keçid. *Meşənin dərkalı. Dağın dərkalı.*

**DƏRKAR** [*fars.*]: **dərkar etmək** *köhn.* – işlətmək, istifadə etmək, faydalanmaq. **Dərkar olmaq** *köhn.* – iş sahibi olmaq, iş başında olmaq, işləmək. *Baş tutdu müəllimlərin iclası, syezdi; Ey vay! Uçitellər yenə dərkar olacaqdır.* M.Ə.Sabir.

**DƏRKEDİLMƏZ** *sif.* Dərk edilə bilməyən, başa düşülə bilməyən, anlaşıla bilməyən. *Dərkedilməz müəmma. Təbiətin dərkedilməz sirri yoxdur.*

**DƏRKEDİLMƏZLİK** *is.* Dərk edilə bilməməzlik; başa düşülməzlik, anlaşıla bilməməzlik.

**DƏRKƏNAR** *is.* [*fars.*] Ərizələrin, rəsmi kağızların və s.-nin kənarında, adətən sol bucağında bir idarənin, təşkilatın və s.-nin rəhbəri tərəfindən yazılan mülahizə, göstəriş, sərəncam, qeyd. *Dəmirov o biri nüsxəni çıxarıb sədrə təqdim etdi və dərkənar qoyulmuş vərəqəni götürdü.* S.Rəhimov. *Yunis ərizə və ezamiyyət kağızını çıxarıb göstərdi. Beloborodov oxudu, qələm alıb dərkənar yazdı.* Mir Cəlal.

**DƏRMAN** *is.* [*fars.*] 1. Həkimin resepti üzrə hazırlanan müalicə vasitəsi; dava. *İçmə dərman. Sürtmə dərman. Dərman şüşəsi.* – [Mirzənin] *böyük oğlu, təbib bir yanında əyləşib, tez-tez atasının sinəsinə yaş məhrəba salırdı, lazım olduqca dərman içirdirdi.* Ə.Haqverdiyev.

2. *dan.* Ümumiyyətlə, təbabətdə, zərərvericilərlə mübarizədə və s.-də işlədilən kimyəvi preparatlar. *Keyləşdirici dərman. Qankəsən dərman. Boğazı yaxalamaq üçün dərman. Ağaclara dərman sürtmək. – Oğru qarğalara tüfəng atılır; Qocalmış torpağa dərman qatılır.* S.Vurğun. *Mənə bihuşedici dərman verdilər.* M.İbrahimov.

3. *məc.* Əlac, çarə, tədbir. *Oğlanı dərd apardı; Dərmanı qızda qaldı.* (Bayatı). ☐ **Dərman etmək (eləmək qılmaq)** – əlac etmək, çarə qılmaq. *Dərman elə yari-dərdməndə.* Xətayi. *Eşq dərdilə xoşam, əl çək əlacımdan, təbib; Qılma dərman, kim həlakim zəhri-dərmanındadır.* Füzuli.

**DƏRMANÇI** *is.* Dərman hazırlama mütəxəssisi, dərman hazırlamaqla məşğul olan adam.

**DƏRMANÇİLƏYƏN, DƏRMANÇİLƏYİCİ** *sif. xüs.* Kimyəvi preparatları çiləyən, səpən. *Dərmançiləyən cihaz.*

**DƏRMAN-DAVA** b a x **dərman-davacat**.

**DƏRMAN-DAVACAT** *top.* Cürbəcür dərmanlar, davalar. *Bir neçəsi də vardı ki, papiros tüstülədir, dərman-davacat iyinə tütün qoxusu da qatırdı.* Ə.Əbülhəsən.

**DƏRMANXANA** *is.* [*fars.*] *köhn.* Dərman satılan və ya qayrılan yer; aptek. *Həkimin nüsxəsini heç dərmanxanaya aparmadım.* Mir Cəlal.

**DƏRMANLAMA** *k.t.* "Dərmanlamaq"dan *f.is. Dərmanlama maşınları.*

**DƏRMANLAMAQ** *f. k.t.* Kimyəvi preparatlar vurmaq, sürtmək və ya səpmək. *Toxumu dərmanlamaq. Meyvə ağaclarını dərmanlamaq.*

**DƏRMANLANMA** *k.t.* "Dərmanlanmaq"dan *f.is.*

**DƏRMANLANMAQ** *məch. k.t.* Kimyəvi preparatlar vurulmaq, sürtülmək, yaxud səpilmək. *Yetmiş hektar sahə tamamilə hazırlanmış, bu sahəyə səpiləcək çiyid seçilib qurtarmış, dərmanlanmışdı.* M.İbrahimov.

**DƏRMANLATMA** "Dərmanlatmaq"dan *f.is.*

**DƏRMANLATMAQ** "Dərmanlamaq"dan *icb. Ağacları vaxtında dərmanlatmaq.*

**DƏRMANLAYICI** *sif.* Dərmanlama üçün yarayan, dərmanlamaq işləri ilə məşğul olan. *Dərmanlayıcı cihaz. Dərmanlayıcı işçi.*

**DƏRMANLI** *sif.* Tərkibində dərman olan (bax **dərman** 2-ci mənada). *İstəkanın qanlıdır; Əl vurma, dərmanlıdır; Yurdumu xəbər alsan; Əslim Girdimanlıdır.* (Bayatı).

**DƏRMANPƏZİR** *zərf* [*fars.*] *klas.* Müalicəsi olan, çarəsi olan, əlacı olan, dərmanı olan, sağaldıla bilən. [Fərman:] *Mənim mərəzim dərmanpəzir deyil...* Ə.Haqverdiyev.

**DƏRMANSIZ** *sif.* Çarəsiz, əlacsız, davası olmayan, sağalmaz. *Dərmansız dərd. – Çəkməyən eşqin bəlasın, görməyən hicran qəmin; Dərdi dərmansızdır anın, çarə yox dərmanına.* Nəsimi. *Dil necə ağlayıb çəkməsin zarı, Hər gün artar bir dərmansız azarı.* Ə.Vahid.

**DƏRMANSIZLIQ** *is.* Əlacsızlıq, çarəsizlik; əlacı, çarəsi, dərmanı olmama.

**DƏRMƏ** 1. "Dərmək"dən *f.is.*

2. *sif.* Dərilmiş, bir-bir toplanmış. *Dərmə meyvə. Dərmə tut.*

3. *sif.* Naxışlı. *Dərmə kilim. Dərmə cecim. Dərmə corab.*

**dərmə-dərmə** *sif.* Naxışlı, bəzəkli. *Dağ, təpə dərmə-dərmə; Xalların dərmə-dərmə; Yetişməmiş nar gördüm; Çağırır dərmə, dərmə.* (Bayatı).

**DƏRMƏDİRLİK** *is. məh.* Qənimət etmə, hər nə ələ gəldi götürmə. ☐ **Dərmədirlik etmək** – əlinə keçəni götürmək. *Hər kəs özünə dərmədirlik edir, qadın libasından, kişi paltarından qənimət toplayır*(*dı*). S.Rəhimov.

**DƏRMƏK** *f.* 1. Meyvə, çiçək və s.-ni bir-bir qoparmaq, toplamaq. *Alma dərmək. Üzüm dərmək. Gül dərmək. – Qızılgülü dərərəm; Pəncərəyə sərərəm; Vəfalı bir yar olsa; Yolunda can verərəm.* (Bayatı). *Başına döndüyüm, ay qəşəng pəri; Adətdir dərərlər yaz bənövşəni.* Qurbani. *Bağın nemətləri olduqca dən-dən; Əmirxan onları vaxtında dərdi.* S.Vurğun.

2. Corab, kilim və s.-də olan yırtığı toxuyub yamamaq. *Corabın yırtığını dərmək.*

**DƏRMİYAN** *is.* [*fars.*] *köhn.* Orta, ara. ☐ **Dərmiyan etmək (eləmək)** – ortaya qoymaq, araya çəkmək. *Dərmiyan eylədikdə pul sözünü; Hər kəs işdən kənar edir özünü.* M.Ə.Sabir.

**DƏRNƏ**[1] *is. məh.* 1. Yengə. *Gəlinin dərnəsi kim idi?*

2. Toy başçısı. *Dərnə olmaq.*

**DƏRNƏ**[2] *is. məh.* Ayaqqabı qoyulan taxça. *Başmaqları dərnəyə qoymaq.*

**DƏRNƏK** *is.* Müəyyən bir məşğələ üçün vaxtaşırı bir yerə toplaşıb məşğul olan adamlar qrupu. *Xor dərnəyi. Dram dərnəyi. Ədəbiyyat dərnəyi. – Klubun Şərq və Qərb musiqi dərnəkləri müxtəlif havalar çalır, kişi və qadınlar rəqs edirdilər.* S.Hüseyn. *Badam xala birinci gün dərnəkdə ağzını açmadı.* Mir Cəlal.

**DƏRNƏKÇİ** *is.* Dərnək iştirakçısı, dərnək üzvü. *Bir gün dərnəkçilərimi ekskursiya üçün seçki* [məntəqəsinə] *aparmışdım.* Mir Cəlal.

**DƏRNƏKÇİLİK** *is. kit.* Yalnız bir qrupun, bir təbəqənin məhdud mənafeyini güdən iş.

**DƏRO** *is. məh.* [*fars.*] Ləkdən ləkə keçən su yolu. *Ləklərin dərosunu açıb suyu buraxmaq.*

**DƏROSƏR** *is.* [*fars.*] Pəncərə və qapı yerlərinin üstünə qoyulan tir və taxtalar. *Qapı dərosəri. Taxçanın dərosəri. Palıd dərosər.*

**DƏRRAKƏ** *is.* [*ər.*] Ağıl, düşüncə, şüur, anlaq; dərketmə qabiliyyəti. *Məqsudunu, məramını qandıran; Dərrakədə kamil olan yar hanı?* Aşıq Məhəmməd. *İnsanda istedad lazımdır, yəni zehin və qabiliyyət, şüur və dərrakə lazım*(*dır*). C.Məmmədquluzadə. *Xanpəri indi hər işi dərrakə ilə görürdü.* Ə.Vəliyev.

**DƏRRAKƏLİ** *sif.* Dərrakəsi olan; ağıllı, düşüncəli, anlaqlı. *O oğlan yaşda səndən kiçikdir, amma qat-qat dərrakəlidir.* S.Rəhman.

**DƏRRAKƏLİLİK** *is.* Şüurluluq, düşüncəlilik, fəhmlilik, anlaqlılıq.

**DƏRRAKƏSİZ** *sif.* Dərrakəsi, şüuru, düşüncəsi olmayan; şüursuz, düşüncəsiz, anlaqsız, küt. *Dərrakəsiz adam.* – [İmamyar:] *Adə, nə dərrakəsizsən, barının nə qədər uzunluğu var?* C.Cabbarlı.

**DƏRRAKƏSİZLİK** *is.* Düşüncəsizlik, fəhmsizlik, şüursuzluq, anlaqsızlıq, kütlük.

**DƏRS** *is.* [*ər.*] 1. Müəyyən bir fənni öyrənmək üçün daimi, müntəzəm təlim. *Edirəm kəsbi-elm leylü nəhar; Gündüzüm dərsdir, gecəm təkrar.* S.Ə.Şirvani. // Tədris işi, məktəbdə məşğələ. *Dərslər saat 9-da başlanır. – Payız fəsli daxil oldu. Dərslər başlandı.* C.Məmmədquluzadə. [Nigar] *hər gün dərsə gedir, iclasları da buraxmayırdı.* S.Hüseyn. // Ayrıca bir fənnə həsr olunmuş vaxt, saat. *Üçüncü dərs ilə dördüncü dərs arasında böyük tənəffüs. – Aşağı siniflərdə birinci dərslərim pis keçmədi.* A.Şaiq.

2. Gələn məşğələyə hazırlaşmaq, oxuyub öyrənmək üçün müəllimin şagirdə verdiyi tapşırıq, iş. *Dərsini hazırlamaq* (*öyrənmək*). *Dərslərini yaxşı bilmək.* // Məktəbdə keçilən fənnin hər biri. *Musiqi dərsi. Riyaziyyat dərsi. – Ədəbiyyat dərsi .. maraqlı idi, elə bil hamı dadlı həyatın şeri ilə nəfəs alırdı.* M.Hüseyn. *Reyhan bütün dərslərindən; Hər bir zaman beş alırdı.* M.Dilbazi. // Oxuma, təhsil alma. *..Aqil də yır-yığış edib şəhərə, dərsə gəlməyə hazırlaşırdı.* Mir Cəlal. ◻ **Dərs oxumaq** – təhsil almaq. [Fərman] *məktəbdə dərs oxuyur, kənd klubunda kino tamaşalarına baxır, rayon mərkəzindən və Bakıdan gələn artistləri dinləyirdi.* Ə.Sadıq. // Təhsil, elm, bilik, savad. *Onun dərsi azdır. – ..Mən ləqəb sözünü bildirə kimi bilməzdim, çünki dərsim o qədər yoxdu.* C.Məmmədquluzadə.

3. *məc.* Nəsihət, təlqin, öyrətmə. *Dərsini yaxşı veriblər.* // İbrət, gələcək üçün nəticə çıxarıla biləcək bir şey, hadisə. *İnsan üçün böyük dərslərin biri də tarixdir.* C.Məmmədquluzadə. ◻ **Dərs almaq** – ibrət götürmək, öyrənmək. *Yaxşı yoldaşdan dərs almaq. – Gah batan, gah çıxan qış günəşindən; Dərs alıb dayanma gendə, ey ilham.* M.Müşfiq. **Dərs olmaq** – ibrət olmaq. *Qoyun örnək olsun qalanlarına; Dərs olsun bu, qoca-cavanlarına.* H.K.Sanılı.

4. *məc.* Tənbeh, cəza. ◻ **Dərs(ini) vermək** – tənbeh etmək, cəzalandırmaq. [Orxan:] *Yavər belə qələt eləyə bilməz. Yoxsa, Səfa o dəqiqə dərsini verərdi onun.* İ.Məlikzadə.

**DƏRSARASI** *sif.* Dərslərin arasında olan. *Dərsarası tənəffüs.*

**DƏRSDƏNKƏNAR** *sif.* Dərslərdən, məşğələlərdən kənar, dərsdən sonra. *Dərsdənkənar məşğələ.*

**DƏRSLİ** *sif. dan.* Savadlı, təhsilli, oxumuş, bilikli. *Dərsli adam.*

**DƏRSLİK** *is.* Hər hansı bir fənnə dair dərs kitabı. *Ədəbiyyat dərsliyi. Əlifba dərsliyi. Sabit dərslik.*

**DƏRSSİZ** *sif. dan.* Elmsiz, təhsilsiz, oxumamış, savadsız. *Dərssiz adam.*

**DƏRUN** *is.* [*fars.*] *klas.* 1. İç, daxil.

2. *məc.* Qəlb, ürək. *Çapdı dərunumu cəlalın şövqi; Ağlımı uğratdı zayə qaşların.* "Aşıq Qərib". [Həsənqulu bəy:] *Bu qədər çirkin ürəkli və qara qəlbli adamlar içində bir nəfər saf dərun və qəlbi pak adam görmək necə böyük xoşbəxtlikdir.* Ü.Hacıbəyov. *Sonra gözlərini onlardan çəkib öz dərununa, qəlbinə çevirdi.* Ə.Əbülhəsən.

**DƏRUNİ** *sif.* [*fars.*] Ürəyə, qəlbə, daxilə, daxili aləmə mənsub olan, aid olan, məxsus olan. *..Ruhiyyat alimləri də başqasının ruhunu və başqasının daruni xüsusiyyətlərini ancaq öz ruhi və dəruni xüsusiyyətləri ilə ölçmüşlər.* M.S.Ordubadi. [Nizami] *Afaqın səsində təqib edilməkdə olan doğma ana dilinin o qəribə və dəruni musiqisini eşidib həyəcanlanır, bu dildə yaratmaq, bu dildə ötmək, bu dildə ağlamaq həsrəti qəlbini yandırıb-yaxırdı.* Ə.Məmmədxanlı. // Ürəkdən gələn, içdən gələn, səmimi. *Mədəndə işə girdikləri ilk həftədən bu balaca otaqda dəruni bir dostluq yaranmışdı.* M.Hüseyn.

**DƏRVAZA** bax **darvaza**. *..Palanlı ata minmiş bir qocanı dərvazamızın ağzında durmuş gördüm.* S.S.Axundov.

**DƏRVİŞ** *is.* [*fars.*] 1. Qapı-qapı gəzərək, yaxud meydançalarda adamları başına yığaraq peyğəmbərə, imamlara və Kərbəla hadisələrinə həsr olunmuş qəsidələri avazla oxuyub pul yığan adam. *Dərviş yabısı hər evin yolunu tanıyar.* (Ata. sözü). *Əlli dərviş, əlli mərsiyəxan; Hamının sözləri tamam yalan.* S.Ə.Şirvani.

2. Yoxsul, kasıb, fağır, yazıq mənasında. *Məni-dərvişə el həm cövr edər, sən cövr qıldıqca...* Füzuli. [Kərimxan dedi:] *..Nə zəhmət olacaq, dərvişin olanından...* M.İbrahimov.

◊ **Dərviş toyu** – dərvişin iştirakı ilə keçirilən toy. [Xacə Abdulla:] *Oğul, sənə dərviş toyu eləyəcəyəm*. (Nağıl).

**DƏRVİŞANƏ** *sif.* [*fars.*] *köhn*. Dərviş kimi, dərvişə xas; dərvişə layiq, kasıb, yoxsul. *Dərvişanə bir süfrə. Dərvişanə bir ev*.

**DƏRVİŞLİK** *is. köhn*. 1. Dərviş sənəti və peşəsi. *Dərvişlik etmək. – Dərvişlikdən xəbəri yox, gecə-gündüz təkyə axtarır.* (Ata. sözü). *Bu məqamda bir cavan girdi meydana: "Dərvişlik oyunbazlıqdır məgər?" – deyib, dərvişlərə nə yemisən turşulu.* N.Vəzirov.

2. *məc*. Yoxsulluq, kasıblıq, fağırlıq.

**DƏRYA** *is.* [*fars.*] 1. Dəniz. *Bənzərəm bir qocaman dağa ki, dəryada durar.* M.Ə.Sabir. *Ağır-ağır, bulud kimi fövclər; Gəlir, verir dərya kimi mövclər*. A.Səhhət.

2. *məc*. Təşbehlərdə, müqayisələrdə: hədsizlik, son dərəcə çoxluq, bolluq, tükənməzlik, nəhayətsizlik bildirir. [Əsgər bəy:] *Mən ki bilirəm,* [Hacı Qara] *Ağcabədidə üç aydır üç top çit, qədək satmayıbsan, dərya zərərin vardır.* M.F.Axundzadə. *Gözüm yaşı qəmimdən, ağlamaqdan döndü dəryayə; Məni axır həlak eylər bu çeşmixunfəşan sənsiz.* S.Ə.Şirvani. *Artıq onun yuxusu; Olmayacaq xələldar; Onda fırtına görmüş; Bir dərya sükutu var*. R.Rza. ☐ **Dəryalar qədər** – son dərəcə çox, intəhasız dərəcədə. **Elm dəryası** (bəzən istehza ilə deyilir) – çox elmli, çox oxumuş, çox bilikli adam haqqında. *Kişi elm dəryasıdır!* – [Heydər ağa:] *..Maşallah, cənab şeyx elm dəryasıdır, mən belə alim görməmişəm.* C.Məmmədquluzadə. **Fikir (qəm) dəryasına qərq olmaq** – çox fikirli olmaq, dərin fikrə dalmaq. .. *Məhəmmədhəsən əmi qəm dəryasına qərq olmuşdu.* C.Məmmədquluzadə. *Fəxrəddin fikir dəryasına qərq olmuşdu.* M.S.Ordubadi.

**DƏRYACA** b a x **dəryalar qədər** (**"dərya"**da). *Əziziyəm gül əllər; Şana barmaq, gül əllər; Dəryaca ağlın olsa; Yoxsul olsan güləllər.* (Bayatı).

**DƏRYAÇA** *is.* [*fars.*] Süni dəniz, kiçik dəniz. *Yeni dəryaçalar, çaylar üzündə; İqlimdən-iqlimə gedib-gəlirlər.* S.Vurğun. // Göl. *Bəli, qardaşlar üçü də keçdilər. Abambar özü də dəryaçanın bu iri tərəfinə keçəndən sonra, piləyib suyu qarnından qaytardı dəryaçaya.* (Nağıl). // *dan*. Həyətlərdə, bağlarda böyük su hovuzu, böyük çarhovuz.

**DƏRYAZ** *is.* Ot çalmaq üçün uzunsaplı, dişsiz orağa oxşayan alət; kərənti. *Əlində dəryaz ot biçir; Mayis ayı biçinçilər.* A.Səhhət. *Yaşıl çiçəkli çəmənlərdə dəryazlar hərlənir, ot tayaları basılırdı.* S.Rəhimov.

**DƏRYAZLAMA** "Dəryazlamaq"dan *f.is.*

**DƏRYAZLAMAQ** *f.* Dəryazla biçib yerə sərmək; kərəntiləmək. *Otu dəryazlamaq.*

**DƏRYAZLANMA** "Dəryazlanmaq"dan *f.is.*

**DƏRYAZLANMAQ** *məch.* Dəryazla biçilmək; kərəntilənmək.

**DƏRZ** *is.* Biçilmiş taxıl bağlaması. *Dərz qalağı. Dərz bağlamaq. – ...Dərzlər bağlanır, taya vurulur; Tayalardan böyük qaya qurulur*. A.Səhhət. *Kəndlilər taxıl dərzlərindən taya vurur, vəl sürür, sovuruq atırlar*. M.İbrahimov.

**dərz-dərz** *zərf* Dərzlər halında. *Dərz-dərz bağlamaq*.

**DƏRZBAĞLAYAN** *sif. tex.* Biçilmiş taxılı dərz halında bağlayan. *Dərzbağlayan maşın.*

**DƏRZDAŞIYAN** *sif. k.t.* Dərzləri bir yerdən başqa yerə daşıyan. *Dərzdaşıyan maşın*.

**DƏRZƏLAH** *is. məh*. Otun tökülməməsi üçün yüklü arabanın üstünə və yanlarına uzadılan ağac.

**DƏRZƏNƏK** *is. məh*. İynəşəkilli xırda yarpaqları olan, yerə sərilən ot bitkisi.

**DƏRZİ** *is.* Paltar biçib-tikən usta. *Dərzi şagirdi. Uşaq dərzisi. – Dərziyə köç dedilər, iynəsini sancdı yaxasına.* (Ata. sözü). *Boyaqçıya, başmaqçıya, dərziyə; Havaxtadək olacağıq ikiqat?* Q.Zakir.

**DƏRZİXANA** *is.* Dərzilərin işlədiyi yer, paltar biçilib-tikilən yer. *Yeməklər ümumi mətbəxdə hazırlanır, geyim isə dərzixanada tikilir.* M.S.Ordubadi. *Yuxarıda, Qoqol küçəsinin tinində isə ev idarəsi, dərzixana, uşaq müalicəxanası yerləşmişdi.* Mir Cəlal.

**DƏRZİQUŞU** *is. zool.* Sərçələr dəstəsindən kiçik meşə quşu.

**DƏRZİLİK** *is.* Dərzinin peşəsi, sənəti, işi. *Dərzilik etmək.*

**DƏRZLƏMƏ** "Dərzləmək"dən *f.is.*

**DƏRZLƏMƏK** *f.* Biçilmiş taxılı, otu dərz halına salmaq, dərz bağlamaq.

**DƏRZLƏNMƏ** "Dərzlənmək"dən *f.is.*

**DƏRZLƏNMƏK** *məch.* Dərz halına salınmaq, dərz bağlanmaq (biçilmiş taxıl, ot).

**DƏRZLİK** *sif.* Dərz bağlamağa yarayan, dərz bağlamaq üçün hazırlanmış. *Dərzlik taxıl.*

**DƏRZYIĞAN** *sif. tex.* Hazırlanmış dərzləri yığan, toplayan. *Dərzyığan maşın.*

**DƏSAYİS** *is.* [*ər.* "dəsisə" *söz. cəmi*] b a x **dəsisə**. *...Adə, bu şəhrdə gəl gör nələr-nələr var imiş; Nə şeytənət, nə dəsayis, nə hiylələr var imiş.* "Mol. Nəsr."

**DƏSGAH** *is.* [*fars.*] 1. Cah-calal, həşəmət, dəbdəbə, təntənə, büsat, böyük şənlik. *Varlı yoxsullaşanda əlli il dəsgahını pozmaz.* (Ata. sözü). *Bəli, qoşun atdandı, böyük cəlal, dəsgahınan bular düşdülər yola.* (Nağıl). // Bəzən kinayə, istehza ilə. *Görmürsən avtomobili, dəsgahı? Özü də bu, hamısının böyüyüdür.* C.Cabbarlı. [Mustafanın] *görürsünüz, şəhərli kimi dəsgahları var!* Mir Cəlal.

2. *məc.* Böyük işlər, təşəbbüs, qeyri-adi mənzərə, əla düzəldilmiş iş. [Bayram kişi:] *Sel gücü də məlumdur, odur, Mingəçevirdə bir dəsgah başlanıb ki, selin-suyun gücü düz-dünyaya işıq və qüvvət verəcək.* M.Rzaquluzadə.

3. *məc.* Bir işin təşkili üçün lazım olan şeylərin, vasitələrin və s.-nin məcmusu. *Taxta məhəccərin dalında çay və xörək dəsgahı üçün xüsusi bir guşə ayrılmışdı.* M.İbrahimov.

4. *məc.* Qurğu, kələk, tədbir. *Lotular hər iki qolu bağlı, özü də çılpaq halda Rəhimin üstünə düşüb xeyli vurardılar. ...Bu zaman Rəhim başa düşərdi ki, bütün bu dəsgahlar bunun üçünmüş.* H.Sarabski. □ **Dəsgah çıxarmaq** – mane olmaq, həngamə yaratmaq. *Dəsgah çıxarma, qoy işimizi görək.*

5. *mus.* Azərbaycan xalq musiqisində irihəcmli muğam, musiqi kompleksi. *Böyük salonda segah dəsgahı qurtardı, oyun havası çalınmağa başlandı.* S.Rəhman. *Nola, Vahid, azacıq sakit ola məclisimiz; Şur dəsgahını biz xahiş edək tarizənə.* Ə.Vahid.

**DƏSGAHLI** *sif.* Cah-calallı, dəbdəbəli, təmtəraqlı, çox yaxşı qurulmuş, təşkil edilmiş. *Heydərovla Səmayə .. dəsgahlı bir toy elədilər.* Mir Cəlal.

**DƏSGİRƏ** *is.* [*fars.*] Qarğı və ya incə çubuqdan hörülmüş kiçik səbət. *Üzümü dəsgirəyə yığmaq.*

**DƏSXOŞ** *is.* [*fars.*] *dan.* Yüngül qazanc, asanlıqla əldə edilən pul və s. // Pul hədiyyəsi; bəxşiş, mükafat. [Saşa bəy:] *Dünən gecə özün demədinmi, Saşa, bu bankı aparsam, sənə əlli manat dəsxoş verəcəyəm.* S.S.Axundov.

◊ **Dəsxoşa getmək** *dan.* – 1) başqasının əvəzinə və ya onun hiyləsi ilə zərərdidə olmaq, cəzalandırılmaq və ya öldürülmək; 2) boş yerə, başqasının hiyləsi ilə pul xərcləmək.

**DƏSİSƏ** *is.* [*ər.*] Hiylə, intriqa, əlaltından iş görmə.

**DƏSMAL** *is.* [*fars.*] 1. Əl-üz və s. silmək üçün ensiz, uzunsov parça; məhrəba. *Üz dəsmalı. Qab dəsmalı. Yaş dəsmalla bədənini sürtmək. – Səməndər dəsmalını qatlayıb çarpayısının başından asdı.* M.Hüseyn. [Mahmud] *üz dəsmalı ilə yarasını sarımış(dı)..* Ə.Əbülhəsən. // Burun və göz silmək üçün kvadratşəkilli parça; yaylıq. *Qadın .. dəsmalı çıxarıb gözünün yaşını silmək istərkən, üzünün bir tərəfini yenə də müdirə göstərdi.* M.S.Ordubadi. [Tahirzadə] *dəsmalını çıxarıb üz-gözünü bərk-bərk sildi.* Mir Cəlal.

2. İçinə şey qoyulub bağlanılan hər cür parça, bağlama. *Qasım əmi dəsmalın içinə bir neçə çörək qoyub bağladı belinə.* C.Məmmədquluzadə. *Qəmər qucağında çiçək və əlində dəsmal bağlısı daxil olur.* S.S.Axundov.

**DƏSMALASAN** *is.* Dəsmal asmaq üçün asqı, qarmaq və s.

**DƏSMALI** *is. mus.* Dəsmal ilə oynanılan Azərbaycan oyun havalarından birinin adı. *"Dəsmalı" da azərbaycanlıların sevimli rəqsidir.*

**DƏSMALLAMA** "Dəsmallamaq"dan *f.is.*

**DƏSMALLAMAQ** *f.* 1. Dəsmalla silmək, qurulamaq. *Əl-üzünü dəsmallamaq. Bədənini dəsmallamaq. – Cavan övrət kürsünün üstə qabağına iki stəkan qoyub məşğul idi stəkan yuyub dəsmallamağa.* C.Məmmədquluzadə.

2. *məc. dan.* Yalandan tərifləmək, yaltaqlanmaq.

**DƏSMALLANMA** "Dəsmallanmaq"dan *f.is.*

**DƏSMALLANMAQ** *məch.* Dəsmalla silinmək, dəsmalla qurulanmaq.

**DƏST**[1] *is.* [*fars.*] 1. Bir adamın geyimini təmin edəcək paltar komplekti. [Mirzə Dadaş:] *Arvad, dur ayağa, gör nə gətirmişəm. İki dəst paltar sənin üçün, iki dəst libas özüm üçün.* N.Vəzirov.

2. Müəyyən məqsəd üçün lazım olan əşya və ya ləvazimatın məcmusu. *Hamballar bir dəst mebel gətirib otaqlara düzdülər.* Mir Cəlal.

**dəst-dəst** *zərf* [*fars.*] Dəstlərlə, çoxluçoxlu, yığın-yığın, topa-topa, qucaq-qucaq. *Dəst-dəst qab-qacaq. Dəst-dəst kağız. – Xan həmişə Mirzə üçün ən qiymətli tirmə şal və ipəkdən dəst-dəst libas düzəldirdi.* S.Rəhimov.

**DƏST**[2] *is.* [*fars.*] *klas.* Əl. *İndi ki almısan iynə dəstinə; Bu şan-şan bağrımı gözə, dur, gözə!* Ə.Nəbati. *Qışda dağlar ağ geyinər, yaz qara; Sağ dəstinlə ağ kağıza yaz qara.* Aşıq Ələsgər.

**DƏSTAN** b a x **dastan**. *Bu sözə nisbət sənə gəl bir hekayət söyləyim; Lütf edib qıl bir nəzər, bu müxtəsər dəstanə bax.* M.V.Vidadi.

**DƏSTAR** *is.* [*fars.*] *köhn.* Əmmamə, çalma.

**DƏSTAVÜZ** *is.* [*fars.*] Bəhanə. *Əlində dəstavüz etmək.* // Dəlil, sübut, əsas. [Qubernator:] *Belə olsun ki, mənim də əlimdə bir dəstavüz olsun.* C.Cabbarlı. *Heç birisini tutmaq üçün əldə dəstavüz yoxdur.* M.İbrahimov.

**DƏSTBƏND** *is.* [*fars.*] *köhn.* Qolbaq, bilərzik.

**DƏSTDİRAZ** *sif.* [*fars.*] *köhn.* 1. Əliuzun, hər şeyə qarışan.

2. *məc.* Zalım, zülmkar.

**DƏSTDİRAZLIQ** *is. köhn.* Əliuzunluq, hər şeyə qarışma. ☐ **Dəstdirazlıq etmək** – əl uzatmaq. [Vəzir:] *Sənin qorxundan heç bir kimsənə bəndələrindən bir fəqirin malına və əyalına dəstdirazlıq edə bilməz.* M.F.Axundzadə.

**DƏSTƏ**[1] *is.* [*fars.*] 1. Birgə fəaliyyət üçün birləşmiş adamlardan ibarət mütəşəkkil qrup. *Geoloji kəşfiyyat dəstəsi. Ovçular üç dəstəyə ayrıldılar. Çalğıçılar dəstəsi. – Molla Nəbiqulu məktəb uşaqlarından bir dəstə düzəltdi.* Ə.Haqverdiyev.

2. Xüsusi hərbi hissə. *Piyada dəstəsi. Kəşfiyyatçı dəstəsi. Partizan dəstəsi. – Sərhədlərdən köhnə qoşunları götürüb yerlərinə təzə və inandığımız dəstələrdən təyin etməliyik.* M.S.Ordubadi. *Dəstə öz komandirinin əmri ilə irəliləyirdi.* Ə.Vəliyev.

3. Qatar. *Quş dəstəsi. – Hərdənbir kəndin üzərindən durna dəstələri ötüb keçirdi.* Ə.Məmmədxanlı.

4. Bir əldə tutulacaq qədər, ip və s. ilə bağlanmış gül, göyərti, ot və s. toplusu. *Bir dəstə nanə. Bir dəstə çiçək. – Ağ nazik əlinlə bir dəstə bağla; Tər buxaq altına düz bənövşəni.* Qurbani. *Abbas odun ilə bərabər bir dəstə quluncar da yığıb bazara gətirmişdi...* S.S.Axundov. *Usta .. əlindəki gül dəstəsini yemək masasının üstünə atdı.* M.Hüseyn. // Bir yerdə bağlanmış, yaxud çin-çin yığılmış eyni cinsli şeylər toplusu. *Bir dəstə qəzet. Bir dəstə kağız pul. – Yarməmməd portfelindən bir dəstə əzik-üzük kağız çıxartdı.* M.İbrahimov. *Kənd poçtalyonu Araza bir dəstə qəzet uzatdı.* Ə.Məmmədxanlı. *İmran kişi eşiyə çıxıb, kabinetinin qapısını bağladı və açar dəstəsini cingilti ilə paltosunun cibinə qoydu.* M.Hüseyn.

5. *zool.* Heyvanların təsnifatında qohum ailələri birləşdirən bölmə. *Buğumayaqlılar dəstəsi.*

**dəstə-dəstə** *zərf* 1) dəstələr halında. *Odur, atlılar ya dəstə-dəstə, ya tək-tək uzaqdan görsənirlər.* C.Məmmədquluzadə; 2) qatar-qatar. *Az sonra sanki bütün quşlara xəbər yayıldı. Onlar dəstə-dəstə uçub gəldilər.* Ə.Məmmədxanlı.

**DƏSTƏ²** *is.* [*fars.*] Bir şeyin əl tutulan yeri, tutacaq yeri; sap, qulp, qəbzə. *Qapı dəstəsi. Qılınc dəstəsi. Mişarın dəstəsi. – Xəncərin dəstəsindən tutarkən; "Mən" səsləndi bir nəfər igid oğlan.* A.Səhhət. [Mirzə Kərim:] *Haydı qardaşlar, ürəklə yapışın kotanın dəstəsindən!* Ə.Haqverdiyev. *Böyük Koroğludan qalmış yadigar; Budur, dəstəsində barmaq yeri var.* S.Vurğun.

**DƏSTƏ³** *is.* [*fars.*] *köhn.* Gecə, yaxud gündüz saat on iki. *Xeyr, ağa, dəstədən təqribən üç saat yarım keçəndə, yəni günortaya təqribən nə qalır?* C.Məmmədquluzadə. [Vaqif] *..qələmi yerə qoyub saatına baxdı, əqrəblər düz dəstənin üstündə idi.* Çəmənzəminli.

**DƏSTƏBAŞÇI** bax **dəstəbaşı**. *Bəli, məclis qurulur, mənəm-mənəm deyənlər əyləşirlər yuxarı başda, dəstəbaşçıları düzülürlər bir tərəfdən.* C.Məmmədquluzadə. *Dəvəçilərin dəstəbaşçısı xəbər yolladı ki, qoy Növbər dəstəsi dayansın.* P.Makulu.

**DƏSTƏBAŞÇILIQ** bax **dəstəbaşılıq**.

**DƏSTƏBAŞI** *is.* Hər hansı bir dəstəyə başçılıq edən adam. [Qarovul:] *Dəstəbaşımız da öz mağarasında əyləşib, üç gündür nə isə bizimlə danışmaq istəmir.* Ə.Haqverdiyev. *Lakin dəstəbaşı araya soxulan bu artıq adamı çıxarmaq istədi.* Mir Cəlal.

**DƏSTƏBAŞILIQ** *is.* Dəstəbaşı olma, dəstə başında durma, dəstəyə başçılıq etmə.

**DƏSTƏBAZ** *sif.* [*fars.*] Özünə tərəfdar olan adamlardan dəstə düzəldib fikrini, işini yeritməyə çalışan adam (mənfi mənada işlənir).

**DƏSTƏBAZLIQ** *is.* Dəstə düzəltmə, dəstəbazın gördüyü iş (mənfi mənada işlənir). *Dəstəbazlıq etmək.*

**DƏSTƏBƏDƏSTƏ** *zərf* [*fars.*] Dəstə-dəstə olaraq, dəstə ilə, dəstə halında. *Götürüb xublardan dəstəbədəstə; Barı, gəl öləndə qəbrimin üstə.* Q.Zakir. *Qəm ləşkəri durub dəstəbədəstə; Könül şəhrin tarac eyləmədinmi?* M.V.Vidadi.

**DƏSTƏÇİ** *is.* Dəstə iştirakçısı, yaxud dəstə düzəldən şəxs.

**DƏSTƏÇİN** *sif.* [*fars.*] Seçmə, bir-bir dərilən və dəstə halında yığılan. *Dəstəçin üzüm. Dəstəçin alma.*

**DƏSTƏK** *is.* [*fars.*] 1. Bax **dəstə²**. *Şəmiddin ağa ayağa durdu. Əlini qapının dəstəyinə uzatmazdan əvvəl dönüb anasına baxdı.* İ.Şıxlı. // Mexanizmi, cihazı və s.-ni çevirmək və ya döndərmək üçün onun əl ilə tutulan hissəsi. [Kosaoğlu] *telefonun qulpunu hərləyib zəng etdi. Dəstəyi götürüb qulağına yaxınlaşdırdı.* İ.Şıxlı.

2. Ağacdan və ya başqa şeydən olan sütun. *Qadir dəstəyə söykənib durdu.* Ə.Əbülhəsən.

3. Sınmamaq üçün meyvəsi çox olan ağac budaqlarının altına qoyulan bir ucu haça ağac; paya, dayaq. *Alma ağacının dəstəyi.*

4. Bəzi cihazların dayağı, dayanacağı, ayağı. *Fotoaparatın dəstəyi.*

**DƏSTƏKLƏMƏ** "Dəstəkləmək"dən *f.is.*

**DƏSTƏKLƏMƏK** *f.* 1. Dəstək vurmaq, dayaq vurmaq. *Alma ağacını dəstəklədilər.*

2. *məc.* Kömək etmək, arxa durmaq, müdafiə etmək, tərəfdar olmaq. *Dediyi sözləri dəstəklədim mən: – O qənim kəsilib, – dedim, – ölkəyə; Cavidlər sürülüb öz Vətənindən.* B.Vahabzadə.

**DƏSTƏKLƏNMƏ** "Dəstəklənmək"dən *f.is.*

**DƏSTƏKLƏNMƏK** *məch.* 1. Altına dəstək vurulmaq, dayaq vurulmaq.

2. *məc.* Müdafiə edilmək, kömək edilmək.

**DƏSTƏKLƏTMƏ** "Dəstəklətmək"dən *f.is.*

**DƏSTƏKLƏTMƏK** *icb.* Dəstək vurdurmaq. *Tənəkləri dəstəklətmək. Əyilən çəpəri dəstəklətmək.*

**DƏSTƏKLİ** *sif.* Dəstəyi olan. [Qılınc:] *Bu gümüş dəstəkli qılınc mənə çatar...* M.Hüseyn. [Buğacın] *..belində .. şirmayı dəstəkli, qırmızı qınlı bir bıçaq .. var idi.* M.Rzaquluzadə.

**DƏSTƏKLİK** *sif.* Dəstəyə (3-cü mənada) yarar. *Dəstəklik ağac.*

**DƏSTƏKSİZ** *sif.* Dəstəyi olmayan, tutacağı olmayan, əl tutmağa yeri olmayan. *Dəstəksiz qapı.*

**DƏSTƏLƏMƏ** "Dəstələmək"dən *f.is.*

**DƏSTƏLƏMƏK** *f.* 1. Dəstə halına salmaq, dəstə etmək. *Uşaq yığdığı sünbülü dəstələməkdə olduğundan Tapdığı tanımadı.* Ə.Əbülhəsən.

2. Bir yerə yığmaq, yığışdırmaq. [Qazı] *..utandığından Güllü qızın üzünə də baxa bilməyib, abasının ətəyini dəstələyib evinə getdi.* (Nağıl). *Xanpəri tez ayağa durub tumanının ətəklərini dəstələdi, "gecəniz xeyrə qalsın!" – deyib cəld çölə firlandı.* Ə.Vəliyev. *Aftab xanım tumanının ətəyini əlində dəstələyib yavaş-yavaş pilləkənlə ikinci mərtəbəyə çıxmağa başladı.* Ə.Abasov.

3. Çin-çin yığmaq. *Muzdur kişi indi cığcığa kimi yüzlükləri on-on bir-birinin üstə dəstələyib evin ortasında düzdü.* S.M.Qənizadə.

**DƏSTƏLƏNDİRMƏ** "Dəstələndirmək"-dən *f.is.*

**DƏSTƏLƏNDİRMƏK** *f.* Dəstə halına salmaq, dəstə bağlamaq.

**DƏSTƏLƏNMƏ** "Dəstələnmək"dən *f.is.*

**DƏSTƏLƏNMƏK** 1. *qayıd.* Dəstə halına gəlmək, bir arada toplaşmaq, yığışmaq, birləşmək.

2. *məch.* Dəstə halına gətirilmək, dəstə-dəstə edilmək.

**DƏSTƏLƏŞMƏ** "Dəstələşmək"dən *f.is.*

**DƏSTƏLƏŞMƏK** *qarş.* Dəstə halında toplaşmaq, dəstə-dəstə bir yerə toplaşmaq; qruplaşmaq.

**DƏSTƏLƏTDİRMƏ** "Dəstələtdirmək"-dən *f.is.*

**DƏSTƏLƏTDİRMƏK** b a x **dəstələtmək**. *Çiçəkləri dəstələtdirib güldanlara qoydurmaq.*

**DƏSTƏLƏTMƏ** "Dəstələtmək"dən *f.is.*

**DƏSTƏLƏTMƏK** "Dəstələmək"dən *icb.* *Adamları dəstələdib yola saldılar.*

**DƏSTƏLİ** *sif.* Dəstəsi olan, əl tutmaq üçün yeri olan. *Gümüş dəstəli bıçaq* (*çəngəl*). *– Gülnaz qaçıb evdən taxta dəstəli, pas atmış uzun bıçağı gətirdi.* M.İbrahimov.

**DƏSTƏMAZ** *is.* [*fars.*] *din.* Namazdan, bəzən də Quranı ələ alıb oxumaqdan əvvəl yuyunma (üzü, dirsəyə qədər qolu yuma və başın ortasına, eləcə də ayaqların üst tərəfinə su çəkmə) ayini. *Dedi: – Bəs mən gedim bulağa tərəf; Dəstəmazım mənim olubdu tələf.* S.Ə.Şirvani. ☐ **Dəstəmaz almaq** – həmin ayini icra etmək. *Bir gün bir nəfər molla, necə olursa, məscid həyatində dəstəmaz alanda çarhovuza düşür.* "M.N.lətif." [Cahan:] *Molla Qurana baxmaqdan qabaq dəstəmaz aldı, ya yox?* Ə.Haqverdiyev.

**DƏSTƏMAZLI** *sif. din.* Dəstəmaz almış, dəstəmaz ayini icra etmiş. [Münəvvər xanım] *həmişə dəstəmazlı, ağzıdualı, pak niyyətlə getsə də, nəticə vermirdi.* Mir Cəlal.

**DƏSTƏMİC** *is. məh.* Yelkənli gəmidə yelkəni qaldırmaq üçün işlənən ip. *Dəstəmiclə yelkəni qaldırmaq.*

**DƏSTƏMUZD** *is.* Dəstə (qrup) ilə görülən iş üçün verilən əmək haqqı.

**DƏSTƏRƏK** *is.* Kotanın əl tutulan yeri, dəstəsi.

**DƏSTƏRXAN** *is.* [*fars.*] Süfrə. [Molla] *günorta vaxtı dəstərxanı açır ki, bir az çörək yesin.* "M.N.lətif.". *Məmmədhəsən əmi övrətinin sözünə baxıb çəkildi dəstərxanın başına.* C.Məmmədquluzadə.

**DƏSTFƏRMAN** *is.* [*fars.*] *köhn.* Ayaqüstü işləri görən qulluqçu (oğlan).

**DƏSTGAH** [*fars.*] b a x **dəsgah**. *Xudayar bəy, sənin dəstgahın varmış.* C.Məmmədquluzadə. *Yüz sənə bundan əqdəm ata və babalarımızın dolanacağını, .. fikir və xəyalatını və bilcümlə, o əsrin övza və dəstgahını .. Vaqif gözəl əşar və kəlami-abdarı ilə yazıb..* F.Köçərli. [Gülçöhrə:] *Ox!.. İstəmirəm mən bu dövləti, bu dəstgahı!* Ü.Hacıəyov.

**DƏSTGİR** *is.* [*fars.*] *köhn.* 1. Kömək edən, əldən tutan; yardımçı, himayəçi, köməkçi. *Tutsan əlini məni-fəqirin; Həqq ola həmişə dəstəgirin.* Füzuli. *Deyirlər ki, cəmi füqəranın dəstgiridir.* Ə.Haqverdiyev.

2. Tutulmuş, əl-qolu bağlanmış; əsir. ☐ **Dəstgir etmək** – tutmaq, əlinə keçirmək, başını bağlamaq, əsir etmək. *Uzaq valilərinə də kağız göndər. Hər nə xan varsa, dəstgir edib Tehrana göndər.* C.Cabbarlı. *Camal .. dərin meşələrə girib maralları dəstgir edirdi.* S.Rəhimov. **Dəstgir olmaq** – ələ keçmək, təslim olmaq, əsir olmaq. // *məc.* Əsir, məşğul. *Xanpəri bu fikirlərin əlində dəstgir ikən divar saatı on ikini vurdu.* Ə.Vəliyev.

**DƏSTGİRƏ** *is.* [*fars.*] *köhn.* Qulp, dəstə(k). *Başıbəlalı muzdur naəlac çamadanın dəstgirəsinə yapışıb, Qanlıtəpə tərəfə üz qoydu.* S.M.Qənizadə.

**DƏST-XƏTT** *is.* [*fars.* dəst və *ər.* xətt] 1. Birisinin şəxsən öz əli ilə yazdığı yazı.

*Sübhanverdizadə öz dəst-xətti ilə yazmağına baxmayaraq, bu kimi müxtəlif bəhanələrlə öz yazdığını pozmağı da bacarırdı.* S.Rəhimov.

2. *məc*. Savad. *Üçü də cavab verdilər ki, dəst-xətləri yoxdu.* C.Məmmədquluzadə.

**DƏSTİ**[1] *is.* [*fars.*] Kiçik, lüləksiz bardaq. *Su dəstisi.*

**DƏSTİ**[2] *zərf* [*fars.*] Tez, əlbəəl, əlüstü. *..Məmmədhəsən əmi dəsti getdi.* C.Məmmədquluzadə.

**DƏSTİ-XƏTT** b a x **dəst-xətt**.

**DƏST-PAÇA** *is.* [*fars.*] *köhn.* Təlaşa düşmə, tələsmə, iztirab, çapalama. // *Zərf mənasında.* Təlaş içində, həyəcanlı bir halda, özünü itirmiş halda. *Bu halda qalmaqaldan .. Hatəmxan ağa və Şahbaz bəy yatdıqları damda yuxudan oyanıb dəst-paça, köynəkcək Müsyö Jordanın səsinə yüyürdülər.* M.F.Axundzadə. ☐ **Dəst-paça olmaq** – iztiraba düşmək, əl-ayağa düşmək, təşvişə düşmək, təlaşa düşmək. *O teleqramda nə var ki, həzrəti-vala bu cür dəst-paça oldular?* P.Makulu.

**DƏSTPƏRVƏRDƏ** *is.* [*fars.*] *köhn.* Birinin yetişdirməsi olan, birinin yanında tərbiyə alan, sənət öyrənən adam. *Yazıq övrət Mirzə Nəsibin övrətinin yanına gəlib bu sözləri dedi: – Xanım, bu uşaq axundun dəstpərvərdəsidir.* Ə.Haqverdiyev.

**DƏSTRƏS** [*fars.*] *klas.* Əli çatma, nail olma, yetişmə; əldə etmə, müvəffəq olma. *Yoxdur əlac, çoxdur bu könlümdə həsrətim; Nə vəslə dəstrəs, nə fəraqında taqətim.* S.Ə.Şirvani. ☐ **Dəstrəs olmaq** – nail olmaq, əldə etmək, müvəffəq olmaq, əli çatmaq. *Məqsuduna dəstrəsmi oldun? Dildarinə həmnəfəsmi oldun?* Füzuli. *Hamı istərdi ki, bu yazıların* [heroqliflərin] *açarını kəşf edərək məzmunlarından xəbərdar olub, köhnə bir millətin tarixinə dəstrəs olaydı.* F.Ağazadə.

**DƏSTUR** *is.* [*fars.*] *köhn*. 1. Təlimat, göstəriş. *Sulduz xan konsuldan və Sərdar Rəşidin aldığı dəstura görə, müharibə zamanı Helminin dəstəsini arxadan vuracaq və məhv edəcəkdi.* M.S.Ordubadi.

2. B a x **düstur** 2-ci mənada.

◊ **Dəstur aşı** *etnoqr.* – ər evinə köçəndən sonra qızın atası evindən ona göndərilən plov. *Atası evindən qıza dəstur aşı gəlmək adət idi.* R.Əfəndiyev.

**DƏSTURÜLƏMƏL** *is.* [*fars.* dəstur və *ər.* əməl] *köhn.* Nizamnamə, təlimat, yazılı göstəriş. [Vəzirlərə] *..vaxt ikən hazırlanmış göstərişlər və dəsturüləməl verildi.* M.S.Ordubadi.

**DƏŞNƏ** *is.* [*fars.*] *köhn.* Kiçik xəncər, yaxud silah kimi işlədilən iri bıçaq. *O zaman hələ naqan-zad yox idi, yanımda ancaq dəşnə, iki dənə piştov var idi*. M.S.Ordubadi.

**DƏŞT** *is.* [*fars.*] *klas.* Çöl, səhra, biyaban. *Əqlü-huşum gedib bir Leylivəşdə; Məcnuni-şeyda tək düşmüşəm dəştə.* Q.Zakir.

**DƏŞTİ** *is.* [*fars.*] *mus.* Azərbaycan, habelə İran klassik musiqisində muğamlardan birinin adı.

**DƏVA** [*ər.*] 1. B a x **dava**. *Bir əldə tutub tiğini, bir əldə tutub səng; Dəvaya gəlirsə, ona canım da süpərdir.* S.Ə.Şirvani. *De görüm, küçədə nə var, a kişi? Bu nə dəvadır, anladınmı işi?* M.Ə.Sabir.

2. *köhn*. b a x **teorem**.

◊ **Dəva vəkili** *köhn*. – b a x **advokat**.

**DƏVA** [*fars.*] *klas*. b a x **dava**. *Hər dərdin bir dəvası var.* (Ata. sözü). *Qəm dəfinə camimey dəvadır; Tədbiri-qəm eyləmək rəzadır.* Füzuli. *Dedilər: – İstə ləbindən dərdipünhanə dəva.* S.Ə.Şirvani. ☐ **Dəva etmək** – b a x **dava etmək** (“**dava**”da). *Mən zaminəm ki, olmaya bir illət ilə fövt; Hər xəstəyə dəva edələr gər şərab ilə.* S.Ə.Şirvani.

**DƏVAM** [*ər.*] b a x **davam**. *Ömrümün yox dəvamü payanı.* S.Ə.Şirvani. *Yoxdur dəvam məndə otuz gün kəsalətə*. M.Möcüz.

**DƏVAT** [*ər.*] b a x **davat**. *Al əlinə qələm, dəvat; Mən günü qərani yaz.* Sarı Aşıq.

**DƏVƏ** *is.* Səhralarda və quru çöllərdə istifadə olunan, bir və ya ikihürgüclu, çox dözümlü iri yük heyvanı. *Birhürgüclü dəvə. Dəvə balası. – Dəvədən böyük fil var.* (Ata. sözü). *Karvanda bir dəvə, bir də eşşək; Arıq düşmüş idi mənim yabım tək.* Q.Zakir. [Qartal:] *Bizansa gedən dəvə karvanları hələ qayıtmamışdır...* M.Hüseyn.

◊ **Dəvə oynayanda qar yağar** – öz yaşına, mövqeyinə, vəziyyətinə münasib olmayan hərəkət edən adam haqqında. **Dəvənin boynu kimi (düz)** – düz olmayan şey haqqında.

**Dəvəsi ölmüş ərəb** – başı çox bəlalar çəkdiyi, hər cür məhrumiyyətlərə məruz qaldığı üçün hər şeyə laqeyd baxan adam haqqında.

**DƏVƏCƏR** *is. məh.* Yuxusuz qalan, yata bilməyən adam. *Səhərə qədər dəvəcər olmaq.*

**DƏVƏCİK** *is. zool.* Torqanadlılar nəslindən çox böyük olmayan həşərat (cücü).

**DƏVƏÇİ** *is.* Dəvə saxlamaq və işlətməklə məşğul olan adam. *Dəvəçi ilə dost olanın darvazası gen gərək.* (Ata. sözü). [Əmiraslan baba:] *Bax o zaman, oğul, bu Ağbulağa .. dəvəçi belə çox çətin gəlib çıxırdı..* S.Rəhimov.

**DƏVƏÇİLİK** *is.* Dəvə saxlama və dəvə ilə yük daşıma işi. *Dəvəçiliklə məşğul olmaq.*

**DƏVƏDABANI** *is. bot.* Qol-budaqlı, sürünən kökümsov gövdəli çoxillik ot bitkisi. *Xırda ot bitkisi olan dəvədabanının .. böyük kökyanı yarpaqları uzun saplaqlar üzərində yerləşmişdir.* R.Əliyev.

**DƏVƏDƏLLƏYİ** *is. zool.* Yaşıl rəngli, uzun ayaqlı həşərat növü.

**DƏVƏFINDIĞI** *is.* Cökə ağacının meyvəsi.

**DƏVƏGÖTÜRMƏZ** *sif. dan.* Çox ağır, çox yekə, çox şey tutan, böyük həcmli. *Dəvəgötürməz sandıq.*

**DƏVƏQIRAN** *is. bot.* Quraqlıq yerlərdə və daşlı yamaclarda bitən tikanlı kol və kolcuq.

**DƏVƏQIRXAN** *is.* Keçmişdə dəvələri qırxmaqla məşğul olan adam.

**DƏVƏQULAĞI** *is. bot.* Kökündə aşı maddəsi olan ikiləpəli bitki; süpürgəotu (boyaq kimi işlədilir).

**DƏVƏQUŞU** *is. zool.* İsti ölkələrdə yaşayan, itiqaçan, lakin uça bilməyən çox böyük quş. *Dəvəquşu yükə gələndə qanadını göstərər.* (Ata. sözü). *..Afrika dəvəquşusu heç uça bilməyərək yerdə hərəkət edir. Dəvəquşu indiki quşların ən böyüyüdür. Erkək dəvəquşular 2 m 75 sm-ə qədər hündürlükdə və 75 kq-dək ağırlıqda olurlar.*

**DƏVƏLİ** 1. *is.* Dəvəyə minmiş adam. *Bu gələn dəvəlidi; Atdıdı, dəvəlidi; Yarı əldən qoymaram; Sövdamın əvvəlidi.* (Bayatı).

2. *sif.* Dəvəsi olan.

**DƏVƏOTU** *is. bot.* Marena fəsiləsinə daxil olan birillik ot bitkisi.

**DƏVƏRƏGÖZ** b a x **dabərəgöz**.

**DƏVƏT** *is.* [*ər.*] Hörmətlə bir yerə çağırma (çağırılma); çağırış. *Onlar heç kəsin dəvətini qəbul etmədilər.* M.S.Ordubadi. *Dilara .. Əjdərin dəvəti üzrə kəndə qonaq getmişdi.* Ə.Məmmədxanlı. ☐ **Dəvət etmək (eləmək)** – 1) hörmətlə bir yerə çağırmaq. *Uşaqlar bir neçə gün dincəldikdən sonra bir axşam Mirzə, Usta Zeynalı şama dəvət etdi.* Ə.Haqverdiyev; 2) *kit.* özünü bu və ya başqa cür aparmağı, bir şeyi qəbul və ya bir şeyə riayət etməyi tələb etmək, təklif etmək. *İntizama dəvət etmək.* [Qəhrəman] *..Yusifi sarpdığı əyri yoldan doğru yola dəvət etmək istəyirdi.* Ə.Vəliyev.

**DƏVƏTEDİCİ** *sif.* Çağıran, dəvət edən. *Dəvətedici məktub. – Birinci dəfə olaraq Azərbaycan dilində nümayişə dəvətedici vərəqələr görünməyə başladı.* M.S.Ordubadi.

**DƏVƏTİKANI** *is. bot.* Ən çox quraqlıq yerlərdə və səhralarda bitən, dəvələrin yediyi tikanlı ot bitkisi.

**DƏVƏTLİ** *sif.* Bir yerə (qonaqlığa və s.-yə) dəvət olunmuş, çağırılmış. *Qonaqlığa dəvətli adam. İclasa dəvətli. Bu gün toya dəvətliyəm.*

**DƏVƏTNAMƏ** *is.* [*ər.* dəvət və *fars.* ...namə] Çağırış kağızı, dəvət kağızı. *Bahar bayramına on beş gün qalmış, Toğrul bütün ölkələrə dəvətnamələr yazıb Təbrizə nümayəndələr göndərmələrinə əmr vermişdi.* M.S.Ordubadi. *Barxudar seçki dəvətnaməsinə baxa-baxa qaldı.* Mir Cəlal.

**DƏVƏYUNU** *sif.* 1. Dəvə yunundan toxunmuş. *Dəvəyunu şal.*

2. Dəvənin yunu rəngində olan. *Dəvəyunu parça.*

**DƏYANƏT** *is.* [*ər.*] Möhkəmlik, səbat, öz sözünün üstündə durma. *Şikəstə Zakirəm, cövrü-cəfaya; Onlar tək deyiləm, dəyanətim var.* Q.Zakir. *Zənnimcə, həqiqi dost çox az tapılar ki, onun sədaqət və dəyanətinə etibar edib dar günündə ona ümid bağlayasan.* F.Köçərli. *İllər qayəmizə ilk bahar deyir; Bizdədir dəyanət, etibar deyir.* M.Rahim.

**DƏYANƏTLİ** *sif.* Səbatlı, möhkəm, öz sözünün üstündə duran, bel bağlanıla bilən. *Bütün İraq, fars və Azərbaycan xalqına tapşırılır ki, Toğrula və Eldənizin dəyanətli xələfi olan Cahan Pəhləvan Məhəmmədə bilavasitə beyət etsin.* M.S.Ordubadi. [Cəfərqulu xan:] *Mən sənə and içirəm ki, mən tək də-*

*yanətli nökəri cümlə İranı axtarsan, tapa bilməzsən.* Ə.Haqverdiyev.

**DƏYANƏTLİLİK** *is.* Səbatlılıq, sözünün üstündə möhkəmlik.

**DƏYANƏTSİZ** *sif.* Dəyanəti olmayan, səbatı olmayan, möhkəm olmayan, öz sözünün üstündə durmayan. *Dəyanətsiz adam.*

**DƏYANƏTSİZLİK** *is.* Səbatsızlıq, öz sözünün üstündə durmamazlıq.

**DƏYDİRMƏK** *icb.* Bir şeyi başqasına toxundurmaq, bir şeyin başqasına toxunmasına səbəb olmaq.

**DƏYƏ** *is.* Qarğıdan və s.-dən düzəldilmiş komacıq; alaçıq, qazma. [Sərçələr qışda] *gecələr də samanlığa, dəyələrə; daxmaların, küləş damların deşiklərinə girərək özlərini soyuqdan mühafizə edirdilər.* S.S.Axundov. // Üstüörtülü, yanları açıq tikili; talvar. *Üzümlər gül tökəndə, iyun ayının axırlarında yorğan-döşəyini götürüb, bağda, dəyədə yatırdı.* Mir Cəlal.

**DƏYƏCİK** *is.* Kiçik dəyə. *Dəyəcik qurmaq. Dəyəcikdə yaşamaq.*

**DƏYƏLİK** *is.* 1. Dəyə qurmaq üçün lazım olan (yer, ağac və s.). *Dəyəlik yer.*

2. Dəyələrdən ibarət oba, kənd, şənlik. *Dərənin qırağındakı dəyəlik.*

**DƏYƏNƏK** *is.* 1. Bir başı toppuz çomaq, əl ağacı. *Çoban dəyənəyi. Dəyənək ilə vurmaq. – Əvvəli hənək, axırı dəyənək.* (Ata. sözü). [Yetər:] *Hənək, hənək, axırı dəyənək...* N.Vəzirov. *Gündə yüz yol vurardılar dəyənək; Sağrısı sərbəsər olub döyənək.* S.Ə.Şirvani. [Qulu:] *Əliqulu divandan elə qorxur, necə ki it dəyənəkdən.* S.S.Axundov.

2. *məc.* Güc, zor, kötək mənasında.

3. *məc.* Yüngül söyüş mənasında. [Gülnaz:] *Sənə yüzyaşlı dul arvad yaraşar, ey dəyənək!* Ü.Hacıbəyov.

◊ **Dəyənək kimi** – 1) quru, cod, bərk. *Dəyənək kimi çörək*; 2) dümdüz, hərəkətsiz. [Hacı Ağakərim:] *Rədd ol! Ədə, Xalıq, nə dəyənək kimi dayanmısan!* S.Rəhman.

**DƏYƏNƏKAYAQLILAR** *is. zool.* Qalın dəri təbəqəsi ilə örtülü barmaqları olan cütdırnaqlı heyvanlar.

**DƏYƏNƏKLƏMƏ** "Dəyənəkləmək"dən *f.is.*

**DƏYƏNƏKLƏMƏK** *f.* Dəyənəklə döymək (vurmaq); kötəkləmək.

**DƏYƏNƏKLİ** *sif.* 1. Əlində dəyənək olan.

2. *məc.* Güclü, qoluzorlu.

**DƏYƏR** *is.* 1. Qiymət, baha. *Kitabın dəyəri nədir? Məhsulun maya dəyəri.*

2. *iqt.* Əmtəə istehsalına sərf edilən və bu əmtəədə maddiləşən abstrakt əməyin müəyyən miqdarı. *Dəyərin miqdarı ictimai-zəruri iş vaxtı ilə təyin edilir. İzafi dəyər.*

3. *məc.* Qiymət, əhəmiyyət, ləyaqət, keyfiyyət. *Əsərin bədii dəyəri. Bu sözün heç bir dəyəri yoxdur. – Fəxrəddinin qəhrəmanlığını və ümumiyyətlə, azərbaycanlıların hərbi dəyərini çox gözəl bilirdi.* M.S.Ordubadi. *Gözəl olur bu yerlərin səhəri; Məncə, vardır dünyalara dəyəri.* A.Şaiq.

4. *sif.* Layiq. *Oxumağa dəyər əsər. Görməyə dəyər yer.*

**DƏYƏR-DƏYMƏZİNƏ** *zərf* Həqiqi qiymətindən, dəyərindən ucuz, hər neçəyə gəldi, heçə-puça. – *Sabah Binnət inəyini, ya da danalarını bazara çıxaracaq .. dəyər-dəyməzinə satmalı olacaq.* İ.Məlikzadə.

**DƏYƏRLİ** *sif.* 1. Qiymətli, bahalı; keyfiyyətli. *Dəyərli parça. Dəyərli şey.*

2. *məc.* Qiymətli, ləyaqətli, əhəmiyyətli, çox yararlı, çox lazımlı. *Dəyərli işçi. Dəyərli adam. Dəyərli dost. Dəyərli məsləhət. Onun dəyərli xidməti olmuşdur. – O, hər kəsdən dəyərli, igid, gözəl, sevimli...* C.Cabbarlı. *..Belə dəyərli sözləri ilə dayım bacısını yola gətirmək istəyirdi.* S.S.Axundov.

**DƏYƏRLİLİK** *is.* Dəyərli şeyin hal və keyfiyyəti; qiymətlilik.

**DƏYƏRSİZ** *sif.* 1. Heç bir dəyəri, qiyməti olmayan. *Dəyərsiz şey. Dəyərsiz əsər. Hikmət İsfahani, Mazəndəran malikanəsini Rza xana bağışladığını və bu dəyərsiz hədiyyəni sonsuz məhəbbət əlaməti olaraq qəbul etməsini xüsusi məktubla ona bildirməyi qərara aldı.* M.İbrahimov.

2. Ləyaqətsiz, əhəmiyyətsiz, yararsız, yarıtmaz. *Dəyərsiz adam. Dəyərsiz iş.*

**DƏYƏRSİZLİK** *is.* Dəyərsiz şeyin hal və keyfiyyəti; ləyaqətsizlik, yararsızlıq, yarıtmazlıq.

**DƏYİRMAN** *is.* Dəni üyüdüb una və ya yarmaya çevirmək üçün müxtəlif qurğuları

olan karxana, müəssisə. *Yel dəyirmanı. Su dəyirmanı. Buxar dəyirmanı. – Dəyirmanın yaraşığı torba-çuvaldır.* (Ata. sözü). *Təbrizdə bu saat qəhətlikdir və əhali çörək üzünə həsrətdir. Dəyirmanların sularını kasıblər ki, dəyirmanlar yatsınlar.* C.Məmmədquluzadə. ☐ **Qəhvə dəyirmanı** – qəhvə üyütmək üçün kiçik maşın (dəyirman). **Əl dəyirmanı** – əllə hərəkətə gətirilən, yarma və s. üyütmək üçün kiçik maşın.

◊ **Dəyirman kimi üyüdüb tökmək** – çox danışmaq, boş-boş danışmaq. **Dəyirman xoruzu** – çox sağlam, qıvraq adam haqqında. **Dəyirman şahadı** – dəyirmanda üyüdülən dəndən götürülən üyütmə haqqı. **Dəyirmanın boğazından salsan (altdan) diri çıxar** – son dərəcə zirək və diribaş adam haqqında.

**DƏYİRMANÇI** *is.* Dəyirmanda un üyütməklə məşğul olan adam. *Dəyirmançının şahidi kömbəçi olar*. (Ata. sözü). [Qulamhüseyn:] *Üstümü unlu görüb adımı dəyirmançı çağırma.* M.İbrahimov. // Dəyirman sahibi.

**DƏYİRMANÇILIQ** *is.* Dəyirmançının sənəti, peşəsi. *Dəyirmançılıqla məşğul olmaq. – Cəfər bu gündən dəyirmançılıq etməyə başladı.* Ə.Vəliyev.

**DƏYİRMANDAŞI** *is.* Dəyirmanda unu üyüdən girdə daş.

**DƏYİRMANXANA** *is*. Dəyirman və onun olduğu yer. *Murad .. bir kərə də kənddən, çalışdığı Hacı Rüstəm oğlunun xanasından kənara çıxmamışdı.* S.Hüseyn.

**DƏYİRMANLIQ** *sif.* 1. Dəyirmanda üyüdülmək üçün ayrılmış. *Dəyirmanlıq taxıl. – Sanma əzdikcə fələk bizləri viranlıq olur; Un təmənnası ilə buğda dəyirmanlıq olur.* M.Ə.Sabir.

2. Dəyirman olan yer.

**DƏYİRMƏ** "Dəydirmək"dən *f.is.*

**DƏYİRMİ** *sif.* 1. Dairə şəklində olan; dairəvi, girdə, yuvarlaq. *Üzün ağ, dəyirmi, gözün məstanə; Baxışın bağrımı döndərdi qanə.* M.P.Vaqif. *Xanım dəsmalını çıxarıb ağ dəyirmi üzünü sildi, saçlarını düzəltdi...* Çəmənzəminli. *Kəniz Həlimə içəri girib dəyirmi stolun üstünə təmiz süfrə saldı.* Ə.Abasov.

2. Yumru, yuvarlaq. *Dəyirmi şamama, qarpız.*

**DƏYİRMİCƏ** *sif.* Az dəyirmi, bir qədər dəyirmi (yuvarlaq). *Dəyirmicə çörək.*

**DƏYİRMİLƏMƏ** "Dəyirmiləmək"dən *f.is.*

**DƏYİRMİLƏMƏK** *f.* Dəyirmi (yuvarlaq) hala salmaq, girdə etmək. *Kündəni dəyirmiləmək. – Ucaboylu adam dodaqlarını dəyirmilədib tüstünü tavana üfürdü.* İ.Məlikzadə.

**DƏYİRMİLƏNMƏ** "Dəyirmilənmək"-dən *f.is.*

**DƏYİRMİLƏNMƏK** *f.* Dəyirmi (yuvarlaq) hala gəlmək, girdələnmək, tam dairə şəklini almaq. *Ay dəyirmiləndi.*

**DƏYİRMİLƏŞDİRİLMƏ** "Dəyirmiləşdirilmək"dən *f.is.*

**DƏYİRMİLƏŞDİRİLMƏK** *məch*. 1. Dəyirmi (yuvarlaq) hala salınmaq, girdələşdirilmək.

2. Kəsirsiz hala salınmaq (rəqəm, hesab).

**DƏYİRMİLƏŞDİRMƏ** "Dəyirmiləşdirmək"dən *f.is.*

**DƏYİRMİLƏŞDİRMƏK** *f.* 1. Dəyirmi (yuvarlaq) hala salmaq, girdələşdirmək.

2. Kəsirsiz hala salmaq. *Hesabı dəyirmiləşdirmək.*

**DƏYİRMİLƏŞMƏ** "Dəyirmiləşmək"dən *f.is.*

**DƏYİRMİLƏŞMƏK** b a x **dəyirmilənmək**.

**DƏYİRMİLƏTMƏ** "Dəyirmilətmək"dən *f.is.*

**DƏYİRMİLƏTMƏK** b a x **dəyirmiləmək**.

**DƏYİRMİLİK** *is*. Dəyirmi (yuvarlaq) şeyin halı; girdəlik, yuvarlaqlıq. *Qarpızın dəyirmiliyi. Ayın dəyirmiliyi. Sifətin dəyirmiliyi.*

**DƏYİRMİSİFƏT** *sif.* Girdəsifət, yumrusifət. *Dəyirmisifət uşaq.*

**DƏYİRMİSOV** *sif.* Bir qədər dəyirmi; yuvarlaqtəhər.

**DƏYİŞDİRİCİ** *is. xüs*. Elektrik cərəyanının, qazın və s.-nin istiqamətini, gücünü, müxtəlif mexanizmlərin işinin xarakterini dəyişdirən alət, qurğu, cihaz.

**DƏYİŞDİRİLMƏ** "Dəyişdirilmək"dən *f.is.*

**DƏYİŞDİRİLMƏK** "Dəyişdirmək"dən *məch.*

**DƏYİŞDİRİLMƏZ** *sif.* Dəyişdirilə bilməyən, dəyişdirilməli olmayan.

**DƏYİŞDİRMƏ** "Dəyişdirmək"dən *f.is.*

**DƏYİŞDİRMƏK** *f.* 1. Bir şeyi verib əvəzinə başqa bir şey almaq; mübadilə etmək. *Mal dəyişdirmək. Bir şeyi başqa şeyə dəyişdirmək.*

2. Bir şeyi buraxıb, yenisini, başqasını işlətmək, təzələmək. *Otağın bütün mebelini dəyişdirmək.* // Bir şeyi başqası ilə əvəz etmək. *Paltarını dəyişdirmək.*

3. Bir işdən, vəzifədən, yaxud bir yerdən başqasına keçmək. *Qulluğunu dəyişdirmək. Suyunu dəyişdirmək.*

4. Tamamilə başqalaşdırmaq, başqa şəklə, başqa hala salmaq. *Təbiəti dəyişdirmək. Əsərin quruluşunu dəyişdirmək. Bir fəsildə neçə kərə; Dəyişdirdi öz yönünü, öz yolunu.* B.Vahabzadə.

**DƏYİŞDİRTMƏ** "Dəyişdirtmək"dən *f.is.*

**DƏYİŞDİRTMƏK** *icb.* Dəyişdirməyə məcbur etmək, dəyişdirməsinə nail olmaq.

**DƏYİŞ-DÜYÜŞ** *is. dan.* Qarşılıqlı dəyişmə, mübadilə, bir şeyi verib başqasını alma. ◻ **Dəyiş-düyüş etmək** – qarşılıqlı dəyişdirmək, mübadilə etmək. **Dəyiş-düyüş salmaq** – tay-dəyişik salmaq, yanılaraq birisinin əvəzinə o birisini götürmək. *Ayaqqabıları dəyiş-düyüş salmaq.*

**DƏYİŞƏCƏK** b a x **dəyişək**. [Həcər xanım:] *Get, Xavərə de, bizim üçün dəyişəcək hazır etsin.* S.S.Axundov.

**DƏYİŞƏK** *is.* Alt paltar, tuman-köynək. *Üç dəst dəyişək.* – [Səadət Səriyyəyə:] *Bu oğlan hamamı qızdıracaq, özün də təmizlən, uşaqları da təmiz yu. O, sizə dəyişək də verər.* M.İbrahimov. *...Tapdıq bəlkə qumla dəyişəyini yırtıb dağıtmayınca əl çəkməyəcəkdi.* Ə.Əbülhəsən. // Döşəkağı, yastıqüzü kimi yatacaq ağı.

**DƏYİŞƏKÇİ** *is.* Xəstəxanalarda, sanatoriyalarda, mehmanxanalarda və s.-də dəyişək işlərinə baxan xidmətçi.

**DƏYİŞƏKLİ** *sif.* Dəyişəyi, əvəzi olan. *Dəyişəkli paltar gec dağılar.*

**DƏYİŞƏKLİK** *sif.* Dəyişəyə yarayan, dəyişəyə məxsus. *Dəyişəklik ağ.*

**DƏYİŞƏKTİKƏN** *is.* Dəyişək tikməklə məşğul olan adam, dərzi.

**DƏYİŞƏN** *f.sif.* Bir qaydada, bir halda, bir qərarda qalmayan; dəyişkən, qeyri-sabit, bir haldan başqa bir hala keçən. *Dəyişən hava. Dəyişən külək.* ◻ **Dəyişən cərəyan** *fiz.* – dövri surətdə öz qüvvə və istiqamətini dəyişən elektrik cərəyanı. **Dəyişən hərəkət** *fiz.* – hərəkətin, cismin sürətini vahid zamanda dəyişən növü. **Dəyişən kəmiyyət** *riyaz.* – müxtəlif qiymətlər ala bilən kəmiyyət. **Dəyişən ulduzlar** *astr.* – öz parlaqlığını dəyişən ulduzlar.

**DƏYİŞİK** *is.* 1. B a x **dəyişək**.

2. Dəyişilmiş, səhvən birinin əvəzinə başqası götürülmüş, dəyiş-düyüş edilmiş. ◻ **Dəyişik düşmək** – səhvən birinin əvəzinə başqası düşmək, çaşbaş düşmək. *Qara sözlə, ağ sözün; Yeri dəyişik düşür; Yalançının dilindən; Söz düşür – düşük düşür..* M.Araz. **Dəyişik salmaq** – səhvən birinin əvəzinə başqasını götürmək, çaşbaş salmaq. [Mirzə Heydər:] *Dəyişik salma, hər birin öz yerinə qoy.* Ə.Haqverdiyev.

**DƏYİŞİKLİK** *is.* Başqa şəklə (hala) düşmə, başqalaşma, başqalıq; təbəddülat. *Xəstənin vəziyyətində dəyişiklik görünür. Cəbhədə heç bir dəyişiklik yoxdur. Temperatur dəyişikliyi. – Mühitimdə gördüyüm şeylərin adlarını, onlarda əmələ gələn dəyişiklikləri yenə də* [Tağı əmidən] *öyrəndim.* S.S.Axundov. *Müdirin üzündə heç bir dəyişiklik yox idi.* Ə.Vəliyev. [Elçin:] *Kim düşünə bilər ki, bizim proyektdə bu qədər dəyişiklik ola bilər?* Z.Xəlil. // Yenilik, yeni hal, yeni vəziyyət; dönüş. *İşdə dəyişiklik yaratmaq.* – [Günəşin] *yaradan əlləri kiçik, alçaq otaqların quruluşunda .. böyük bir dəyişiklik əmələ gətirmişdi.* A.Şaiq. *Xədicənin halında bir dəyişiklik vardı.* S.Hüseyn.

**DƏYİŞİLMƏ** "Dəyişilmək"dən *f.is.*

**DƏYİŞİLMƏK** 1. B a x **dəyişmək** 2-ci mənada. [Araz:] *Dəyişilmək təbiətin qanunudur, .. neyləyək ki, bu qanunu durduracaq, dəyişdirəcək iqtidar və qüvvətim yoxdur.* A.Şaiq. [Kərbəlayı Qulu] *zəmanənin dəyişilməyindən bir az danışdı və dərin ahdan sonra ülgücü belindəki qayışa çəkib taraş etməyə başladı.* Çəmənzəminli.

2. "Dəyişmək"dən *məch. Söhbət dəyişilə-dəyişilə* (z.) *xeyli uzandı..* Ə.Abasov. *Günün saf işığı axmış ruhuna; Şüşədən rəng alıb dəyişilərək..* B.Vahabzadə.

**DƏYİŞİLMƏYƏN** *f.sif. riyaz.* Sabit, dəyişməz. *Dəyişilməyən kəmiyyət.*

**DƏYİŞİLMƏZ** *sif.* Dəyişdirilə bilməyən, başqa şəklə (hala) salına bilməyən; olduğu kimi qalan; sabit, daimi.

**DƏYİŞKƏN** *sif.* Çox dəyişən, tez-tez dəyişən, dəyişməyə qabil olan, sabit olmayan. *Dəyişkən rəng. Dəyişkən hava. Dəyişkən xasiyyət. – Melodiyanı təşkil edən bu zil və bəm səslərin .. bəziləri dəyişkən və dayanıqsız olur.* Ə.Bədəlbəyli. *Hibrid orqanizmlər daha dəyişkən olur.* M.Axundov.

**DƏYİŞKƏNLİK** *is.* Çox və tez-tez dəyişmə xassəsi və qabiliyyəti; qeyri-sabitlik. *Hibridlərin dəyişkənliyi.*

**DƏYİŞMƏ** 1. "Dəyişmək"dən *f.is. Təbiətdə maddə itmir və yaranmır, o ancaq müxtəlif dəyişmələrə uğrayır.*

2. *is.* Mübadilə. *Mal dəyişmə.*

3. *qram.* Bax **təsrif**.

**DƏYİŞMƏK** *f.* 1. Bax **dəyişdirmək** 1-ci mənada. [Əli:] *İmanımız haqqı, mən* [Gülnazı] *bir xəzinəyə dəyişmərəm, kişi!..* M.İbrahimov.

2. Başqa şəklə və ya başqa hala düşmək, başqalaşmaq, başqa cür olmaq, təbəddülata uğramaq. *Onun xasiyyəti tamamilə dəyişmişdir. Hava dəyişir. – Murad özünü aldatmışdı: nə evini, nə çocuqlarını, nə də Nigarını kənddə olarkən xəyalında təsəvvür etdiyi kimi görmədi. Onlar beş ilin zərfində dəyişmişdilər.* S.Hüseyn. *Elə ki Dürdanə gənc ana oldu; Dəyişib başqa bir Dürdanə oldu.* M.Rahim.

3. Birini buraxıb, o birinə keçmək. *Yerini dəyişmək. Vəzifəsini dəyişmək.*

**DƏYİŞMƏMƏZLİK** bax **dəyişməzlik**.

**DƏYİŞMƏZ** *sif.* Heç bir vaxt dəyişməyən, sabit şəkildə (halda, vəziyyətdə) qalan; sabit. *Təbiətdə dəyişməz şey yoxdur.*

**DƏYİŞMƏZLİK** *is.* Dəyişməz şeyin hal və keyfiyyəti; sabitlik.

**DƏYMƏ** "Dəymək[1]"dən *f.is. Yerə dəymə.*

**DƏYMƏ** "Dəymək[2]"dən *f.is. Meyvələrin dəyməsi.*

**DƏYMƏDÜŞƏR** *sif.* Hər şeydən tez küsən, tez inciyən, tez sınan. *Dəymədüşər adam. Dəymədüşər uşaq. – Mollanın yaman dəymədüşər xasiyyəti var imiş.* "M.N.lətif." [Halay:] *Adam da bu qədər dəymədüşər olarmı?* S.Rəhimov.

**DƏYMƏDÜŞƏRLİK** *is.* Hər şeydən küsmə, incimə xasiyyəti.

**DƏYMƏK[1]** *f.* 1. Toxunmaq. *Mixək əkdim ləyəndə; Mixək boynun əyəndə; Bir cüt qurban demişəm; Əlim əlinə dəyəndə.* (Bayatı). // Əl vurmaq, əlini toxundurmaq. *Şeylərə dəymə! Kitablara dəymə!* – [Hacı Murad:] *Yox, oğlum, dəymə, yetişəndə yığıb sənə göndərəcəyəm.* S.S.Axundov.

2. Bir şeyə yetişib toxunmaq, rast gəlib toxunmaq. [Aslan bəy:] *..Hər halda 30 güllə atılarsa, ondan biri dəyəcək...* C.Cabbarlı. [Cavad:] *Güllə də igiddən qorxar, o həmişə qorxağa dəyər.* Ə.Vəliyev.

3. *məc.* Toxunmaq, pis təsir etmək, təhqir etmək. *Qəlbinə dəymək. Könlünə dəymək. Onun sözü mənə dəydi. – Eh, gözüm, nə dəyib köyrək könlünə? Ey şirin güftarım, nöşün ağladın?* M.P.Vaqif. [Fəxrəddin bəy:] *Sözün var, söz danış, qəlbə dəymək nə lazım!* N.Vəzirov. *Rövzəxana dəydi baqqalın sözü; Dişlərin qıcırdıb qızardı gözü.* M.S.Ordubadi.

4. "Gözə", "gözünə", "gözümə" sözləri ilə – görünmək, sataşmaq. *Çoxdandır gözümə dəymirsən.* – [Qarovul:] *Gedən yoldaşlardan da gözə bir nişan dəyməyir.* Ə.Haqverdiyev. *Həsən kişinin gözünə bir qaraltı dəydi.* M.İbrahimov.

5. "Qulağa", "qulağına", "qulağıma" sözləri ilə – yetişmək, qulağa çatmaq. [Əmiraslan ağa:] *Ah, yenə qulağıma bir söz dəydi.* S.S.Axundov. *Azca keçməmiş, iki atlının səsi küçədən Gülnazın qulağına dəydi.* M.İbrahimov. *Bayramın qulağına at ayaqlarının tappıltısı dəydi.* M.Hüseyn.

6. "Yerə" sözü ilə – yıxılmaq. *Yeni məhbus üzü üstə yerə dəyib zarımağa başladı.* M.İbrahimov. *Kişi səndələdi, ağzı üstə yerə dəydi.* M.Hüseyn.

7. "Soyuq" sözü ilə – soyuqlamaq, soyuğun təsirindən xəstələnmək. *Gər dəysə soyuq, sancılanıb olsa da bimar; Hökm et, gələ cindar.* M.Ə.Sabir. *Əhməd, balam, üstüaçıq niyə yatıbsan, soyuq dəyər.* A.Divanbəyoğlu.

8. "Bir-birinə" sözü ilə – qarışmaq. *..Dünya və aləm bir-birinə dəyib.* C.Məmmədquluzadə. *Dünya bir-birinə dəyib. Əlində*

*bir berdankası olan hər kəs yerə-göyə sığmır.* Mir Cəlal.

9. *məc*. Baş çəkmək, bir yerə, ya birisinin yanına az vaxt üçün getmək. [Mirzədadaş:] *..Sən get, evə dəy, mən də gedim, görüm arvad süfrəni açıbdırmı?* N.Vəzirov. [Əbil:] *Mən kötükçıxaran maşınlara dəyib, tez gəlirəm.* Ə.Vəliyev.

10. "Köməyi", "yardımı" və s. sözləri ilə – köməyi, yardımı olmaq, faydası olmaq, xeyri olmaq. *Bir-iki qohum və əqrəbasından və bir neçə dövlətli tanışlarından savayı Hacı Məcid əfəndinin kimə faydası dəydi?* C.Məmmədquluzadə. [Aslan bəy:] *Qoy deməsin camaat ki, Aslan bəyin kasıblara bir köməyi dəyməyir..* C.Cabbarlı. *Bu işdə Şəmsiyyə və sərtib Səliminin də* [Firiduna] *köməyi dəymişdi.* M.İbrahimov.

11. *məc*. Mənası olmaq, lazım olmaq. *Belə bir gözəllik uğrunda vuruşmağa dəyirdi.* Ə.Məmmədxanlı. // **Dəyər** şəklində – layiqdir. *Yaxşı maldır, almağa dəyər. Baxmağa dəyər.* // Əks mənada bəzən inkar şəklində işlənir. *Hiç gül olmaz tikənsiz, hiç şadi qüssəsiz; Dərmə gülündən anın, çün güli dəyməz xarinə.* Nəsimi. [Hacı Qara:] *Bu sözlər bir pula dəyməz, axırıncı sözümdür, məni məəttəl eləməyin! Tez olun, yaraqlarınızı salın!* M.F.Axundzadə.

12. **Dəyib-dolaşmaq** şəklində – toxunmaq, sataşmaq, mane olmaq. [Yoldaşlarımızdan biri:] *Nəyimə dəyib-dolaşacaqlar? Yanımda nə pul var, nə qiymətli bir şey.* M.Rzaquluzadə.

13. Bir sıra sözlərə qoşularaq müxtəlif ifadələr əmələ gətirir; məs.: göz dəymək (b a x **göz**), zərər dəymək (b a x **zərər**), başı daşa dəymək (b a x **baş**), dişi-dişinə dəymək (b a x **diş**).

**DƏYMƏK**[2] *f.* 1. Dəymiş hala gəlmək; yetişmək. *Taxıl dəymişdir. Tut dəymişdir.* – *Ağac meyvəni dəyənə qədər saxlar.* (Ata. sözü). *Yavaş-yavaş dəyər, bitər; Ləzzətli, dadlı meyvələr.* A.Səhhət. *Bu yerin misli yoxdur əncir-üzüm dəyəndə.* S.Rüstəm.

2. Yetişmək (çiban, yara haqqında).

**DƏYMƏQAÇ** is. Uşaq oyunlarından birinin adı.

**DƏYMƏMİŞ** *sif.* Kal, yetişməmiş. *Dəyməmiş gilas.* // f.sif. mənasında. *Köhnə yaram qövr elədi təzədən; Təbib nəştər vurdu, yara dəyməmiş.* Aşıq Ələsgər.

**DƏYMƏZ** *əd. mənasında.* Layiq deyil (təşəkkür və razılığa cavab olaraq işlədilir). *Təşəkkürə dəyməz. Razılığa dəyməz. Narahatlığa dəyməz. Baxmağa dəyməz.*

**DƏYMİŞ** *sif.* Yetişmiş, yeyilməli hala gəlmiş. *Dəymiş alça. Dəymiş gavalı.* – *Meşənin dəymiş əzgili saralar; Həm zoğal da dərilməyib qaralar.* A.Səhhət. // *İs. mənasında.* Yetişmiş meyvə. *Dəymişini qoyub kalını dərir.* (Ata. sözü).

**...dək** Zaman və məkanca son nöqtəni bildirən və bitişik yazılan qoşma; ...qədər. *Günortayadək. Vağzaladək. Evədək.* – *..Bakıda yığılan qırx beş min manatdan indiyədək bircə nəfər müsəlman acının qarnı doymayıb.* C.Məmmədquluzadə. *Mirzə Fətəli küçəsini iki kərə məktəbədək gedib qayıtdım.* S.Hüseyn.

**DƏYYUS** *is.* [*ər.*] Öz arvadının xəyanətinə dözən adam; qeyrətsiz, namussuz. // Bəzən söyüş yerində. [Xudayar bəy:] *...Eşşəyi mənə o dəyyus özü veribdi.* C.Məmmədquluzadə.

**DƏYYUSLUQ** *is.* Öz arvadının namussuzluğuna dözmə; qeyrətsizlik, namussuzluq.

**DƏZGAH** *is.* [*fars.*] 1. Ağac, metal və başqa materialları emal edən və müxtəlif şeylər hazırlayan maşın. *Deşmə dəzgahı. Toxuculuq dəzgahı. Qazma dəzgahı.* – *Kərim birbaş qazma dəzgahının yanında durmuş uzunboylu, sarışın adama yaxınlaşdı.* M.İbrahimov. *Son sistemli torna və deşmə dəzgahları yan-yana işləyirdi.* Ə.Sadıq.

2. Üzərində ustaların iş gördükləri böyük masa. *Dərzi dəzgahı. Çilingər dəzgahı.*

3. Xalça, palaz və s. toxumaq üçün qurğu; xana. *Xalçalar hündür dəzgahlarda toxunur.*

4. Quruda qayrılan gəminin oturulduğu qurğu. // Bənnaların, suvaqçıların və b.-nın üstündə dayanıb işlədikləri taxtapuş.

5. Topun, pulemyotun və b. ağır silahların gövdəsinin bənd edildiyi altlıq.

**DƏZGAHALTI** *is.* Dəzgahın altlığı, bünövrəsi.

**DƏZGAHÇI** *is. xüs.* 1. B a x **dəzgahsazlayan**.

2. Dəzgahda işləyən fəhlə.

**DƏZGAHQAYIRAN** *sif.* Müxtəlif dəzgahlar istehsal edən. *Dəzgah qayıran zavod.*

**DƏZGAHQAYIRMA** *sif.* və *is.* Müxtəlif dəzgahlar və onların hissələrini istehsal etmə. *Dəzgahqayırma sənayesi.*

**DƏZGAHLI** *sif.* Dəzgahı olan, dəzgah üstündə duran (b a x **dəzgah** 5-ci mənada). *Hər yer dəzgahlı pulemyot, əl pulemyotu, 50 və 82 millimetrlik .. minasaçanla dolu idi.* Ə.Əbülhəsən.

**DƏZGAHSAZLAYAN** *is. xüs.* Dəzgahları yerində qurub sazlayan usta.

**DIBIR** *is.* 1. Erkək keçi; təkə. *Dıbır əti.* // Doqquz aylıqdan bir illiyə qədər olan keçi.

2. Qoyun sürüsünün başında gedən keçi. *O, böyük sürü sahibi olmuşdu, sürüsünü dörd dıbır ancaq dolandıra bilirdi.* Ə.Haqverdiyev.

**DIBIRIQ** *zərf dan.* Yeyin, cəld. *Dıbırıq getmək.*

**DIĞ** *is.* [*ər.*] Vərəm, ciyər vərəmi.

**DIĞA** *is.* [*erm.*] *dan.* Erməni uşağı, erməni balası (oğlanı). *Yeniyetmə dığalar əl-ələ tutuşub yallı oynayırdılar.* S.Rəhimov. [Kərim bəy:] *Həmzə xozeyin, sən özünü bu dığadan gözlə.* Ə.Əbülhəsən.

**DIĞDIĞ** *is. dan.* 1. Çox quru.

2. Dedi-qodu, adamı təngə gətirən danışıqlar, arası kəsilməyən söz-söhbət, mübahisə. *Dığdığ qardaşı qardaşdan ayırar.* (Ata. sözü).

**DIĞ-DIĞ** *təql.* Qaynayan mayelərin çıxardığı səs.

**DIĞDIĞA** *dan.* b a x **dığ-dığ**.

**DIĞDIĞI** *sif.* və *is. dan.* Çox deyingən (adam).

**DIĞILDAMA** "Dığıldamaq"dan *f.is.*

**DIĞILDAMAQ** *f.* Dığ-dığ etmək, dığ-dığ səs çıxarmaq. *Samovar dığıldayır.*

**DIĞILTI** *is.* Dığ-dığ səsi, qaynama zamanı mayelərdən çıxan səs.

**DIĞIR** *is. dan.* 1. Keçi aşığı.

2. Düyü xırdası.

**DIĞIRLADILMA** "Dığırladılmaq"dan *f.is.*

**DIĞIRLADILMAQ** *məch.* Diyirlədilmək, gillədilmək, yumbaladılmaq.

**DIĞIRLAMA** "Dığırlamaq"dan *f.is.*

**DIĞIRLAMAQ** *f.* Diyirlətmək, gillətmək, yumbalatmaq. *Üzüaşağı dığırlamaq.* – [Qasım] *dəyirman daşı şəklində bir girdə daşı iki təkər üstünə qoyub dığırlayır.* C.Məmmədquluzadə.

**DIĞIRLANMA** "Dığırlanmaq"dan *f.is.*

**DIĞIRLANMAQ** *qayıd.* Diyirlənə-diyirlənə getmək, gillənmək, yumbalanmaq. *Səhəng onun çiynindən düşüb üç-dörd addım qabağa dığırlandı.* İ.Şıxlı. *Balaca zəng cınqıltı ilə dığırlanıb yerə düşdü.* Ə.Əbülhəsən.

**DIĞIRLATMA** "Dığırlatmaq"dan *f.is.*

**DIĞIRLATMAQ** *icb.* Diyirlətmək, gillətmək, yumbalatmaq. [Tapdıq] *özünü divarın dibinə verib tağalağı dığırlatdı.* Ə.Vəliyev.

**DIĞLAMA** "Dığlamaq"dan *f.is.*

**DIĞLAMAQ** *f.* Dığ tutmaq, vərəm xəstəliyinə tutulmaq (çox vaxt məcazi mənada işlənir). *Dığlar insan çıxmasa bu xaneyi-bərbaddən!* M.Möcüz.

**DIĞLANMA** "Dığlanmaq"dan *f.is.*

**DIĞLANMAQ** *qayıd.* Dığ gətirmək, dığ azarına düşmək; həddən artıq yorulmaq, canı üzülmək; təngə gəlmək.

**DIĞLATMA** "Dığlatmaq"dan *f.is.*

**DIĞLATMAQ** *icb.* Dığ azarına salmaq, həddən artıq yormaq, canını üzmək, təngə gətirmək.

**DIQQA** *dan.* b a x **dıqqan(a)**.

**DIQQAN(A)** *zərf dan.* Bir az, lap azca, bir tikə, bir qırıq (çox vaxt "bir" sözü ilə). *Çörəkdən bir dıqqan ver.*

**DIQQAN(A)CIQ** *sif. dan.* Azacıq.

**DIQQI** *dan.* b a x **dıqqılı**.

**DIQQILDATMA** "Dıqqıldatmaq"dan *f.is.*

**DIQQILDATMAQ** b a x **tıqqıldatmaq**.

**DIQQILI** *zərf dan.* Bir az, bir zərrə. *Halvadan dıqqılı uşağa ver.*

**DIQQILTI** b a x **tıqqıltı**.

**DILĞIR** *dan.* 1. *sif.* Tükü tökülmüş, qotur. *Dılğır at. – Sən qovdun kənddən elin kor, dılğır yabısını.* S.Rüstəm.

2. *is.* və *sif.* Boş, avara, lüt, yaramaz. *Dılğırın biridir. – Amma bu dılğırların heç birindən eşitmədim ki, desin: – Bala, adam ol!* C.Məmmədquluzadə. *O dılğır Xəlilin gözünün odunu niyə almamısan ki, .. adın gələndə dizləri əssin?* M.Hüseyn. // *sif. isteh.* Vecsiz, heç bir şeyə yaramayan. *Doğrudur, .. inci-*

*mişəm, ancaq bu, kəndimizin pisliyinə dəlalət etməz ki, iki yüz mənim kimi dılğır adam incisin bizim kənddən..* C.Məmmədquluzadə.

**DILĞIRLAMAQ** *f. dan*. Dılğır olmaq, dılğır hala düşmək; yararsız, boş, gülünc hala düşmək.

**DILĞIRLIQ** *is. dan.* 1. Tükü tökülmüş heyvanın hal və vəziyyəti; qoturluq.

2. *məc.* Qeyri-ciddilik, boşluq, avaralıq; lütlük, yaramazlıq.

**DIMIQ** *is. dan.* 1. Kəsən şeyin iti tərəfi. *Dəhrənin dımığı.* // Kəsən şeyin ucu. *Qiyməkeşin dımığı yuxarı baxır, dəhrəninki aşağı.*

2. Quyruğu yumru qoyun. *Dımıq qoyun.*

**DINBIZ** *sif. dan.* Həddindən böyük, yekəpər. *Dınbız adam. Dınbız tülkü.*

**DINQ** *təql.* Mis və başqa metallara vurulanda çıxan səs.

**DINQADIRINQ** *is. dan.* 1. Mis və s. metalları bir-birinə toxunduraraq, yaxud bir şeylə onları vuraraq səs çıxarma.

2. *isteh*. Çalğı səsi.

**DINQILDAMA** "Dınqıldamaq"dan *f.is.*

**DINQILDAMAQ** *f.* Dınqıltı səsi çıxmaq. *Tar dınqıldadı.*

**DINQILDATMA** "Dınqıldatmaq"dan *f.is.*

**DINQILDATMAQ** *icb.* 1. Toxunduraraq metal qablarda və ya simli musiqi alətində səs çıxarmaq. *Həyətdə palaz döşənib samovar qurulmuşdu. Mollabacı mis ləyəni dınqıldadıb oxuyurdu.* Çəmənzəminli. *Bayır tərəfdən divarların dibi ilə uzanan sərv ağacları yenə də yavaş-yavaş tərpənir və qırmızı taxtapuşu xırdaca-xırdaca dınqıldadırdı.* S.Rəhimov. // *zar*. Çalmaq. *Aşıq da sazı dınqıldadıb, yanıqlı səs ilə oxuyurdu..* Çəmənzəminli. [Ələsgər dayı] *hər axşam balaca nimdaş döşəkcənin üstündə oturub bu sazı dınqıldadır və .. mahnı oxuyardı.* İ.Əfəndiyev. *Yan tərəfdə oturub mandalinasını dınqıldadan Əsgər də sükut edib ona baxdı.* M.Hüseyn.

2. Taqqıldatmaq.

**DINQILI** *sif. dan.* Xırdaca, çox kiçik, çox balaca.

**DINQILTI** *is.* Vurulanda mis qabdan və s.-dən çıxan səs. *Zəngin dınqıltısı. – Çəngəllər tez-tez boşqablara dəyib dınqıltı qoparırdı.* İ.Məlikzadə.

**DINQIR** *is. məh.* 1. Qavala oxşayan çalğı aləti. *Qapıda qulluq edən uzunsaçlı müridlərdən biri dınqır çalmağa başladı.* S.Şamilov. [Cahandar ağa Molla Sadığa:] – *Kəs səsini, dınqıra süzən qurumsaq!* İ.Şıxlı.

2. Kiçik qutu.

3. B a x **danqır**.

**DIRILDAMAQ** *f. dan*. 1. Cırıldamaq. Araba dırıldayır.

2. Çox mənasız, boş danışmaq, baş-qulaq aparmaq.

**DIRMAQLAMAQ** b a x **dırmıqlamaq**.

**DIRMAQLANMA** "Dırmaqlanmaq"dan *f.is.*

**DIRMAQLANMAQ** b a x **dırmıqlanmaq**.

**DIRMALAMA** "Dırmalamaq"dan *f.is.*

**DIRMALAMAQ** *f.* 1. Qazımaq, cırmaqlamaq. [Pələng] *də məni görmüşdü, pəncəsi ilə acıqlı-acıqlı yeri eşir, dırmalayırdı.* A.Şaiq. *Kamal elə bir həyəcanla çığırdı ki, elə bil qaraquş indicə caynaqları ilə onun üz-gözünü dırmalayacaqdı.* M.Rzaquluzadə.

2. *məc.* Qıcıqlandırmaq, əziyyət vermək, pis təsir etmək (bu mənada adətən "qulağı", "qəlbi" və s. sözlərlə işlənir). *İnan ki, bir acı söz, bir baxış, bir incə gülüş; Kədərli, sıtmalı bir qəlbi dırmalar, yaralar.* H.Cavid. *Gözəlliksiz bir sənətin nə duyğusu, nə canı var; O dırmalar qulaqları, balta kimi odun yarar.* S.Vurğun. *Gözümün nurudur qoçaq adamlar; Ruhumu dırmalar şıltaq adamlar.* M.Rahim.

**DIRMANDIRMAQ** "Dırmanmaq"dan *icb.*

**DIRMANMA** "Dırmanmaq"dan *f.is.*

**DIRMANMAQ** *f.* Əl və ayaqlar vasitəsilə dik bir yerə, yuxarıya qalxmaq, dırmaşmaq, çıxmaq. [Qoyunlar] *qulaqlarını qırparaq birdən-birə döndülər, quyruqlarını ata-ata, mələşə-mələşə təpəni başıyuxarı dırmandılar*. A.Şaiq. *İnsanın peşəsi dünyanın yoxuşlarını dırmanmaqdır..* A.Divanbəyoğlu. // Ümumiyyətlə, hündür bir yerə çıxmaq, qalxmaq. *Maşınımız Lənkərandan dağlara doğru nərildəyə-nərildəyə dırmanır.* S.Rüstəm.

**DIRMAŞDIRMA** "Dırmaşdırmaq"dan *f.is.*

**DIRMAŞDIRMAQ** "Dırmaşmaq"dan *icb.* *Rövşən atları daşlığa dırmaşdırdı.* "Koroğlu".

**DIRMAŞMA** "Dırmaşmaq"dan *f.is.*

**DIRMAŞMAQ** b a x **dırmanmaq**. *Dedim: Yaxşıdır, bir daha dırmaşım; Əlimdə salamat*

*qala ta başım.* M.Ə.Sabir. *Anam mənə dağkeçisi deyərdi, çünki qayalara keçi kimi dırmaşırdım...* S.S.Axundov. *Hələ əks-səda kəsilməmiş təpəyə dırmaşan bir gənc .. özlərini qayalara çırpan iki quşu götürdü.* M.Rzaquluzadə.

**DIRMIQ** *is.* Torpağın içində olan quru ot, kök qalıqları və s.-ni darayıb təmizləməyə, kəsəkləri xırdalamağa məxsus kənd təsərrüfatı aləti; çəng. *Kəsəkləri dırmıqla əzmək. Kökündən çıxarılmış quzapayılar dırmıqla yığılır.*

**DIRMIQÇI** *is.* Dırmıqla işləyən adam.

**DIRMIQLAMA** "Dırmıqlamaq"dan *f.is.*

**DIRMIQLAMAQ** *f.* 1. Dırmıqla təmizləmək, kəsəkləri dırmıqla əzmək, hamarlamaq; çəng çəkmək. *Bostan yerini dırmıqlamaq.*

2. Dırmıqla otu darayıb ayırmaq və ya xırmanda küləşi darayıb dəndən ayırmaq.

**DIRMIQLANMA** "Dırmıqlanmaq"dan *f.is.*

**DIRMIQLANMAQ** *məch.* Dırmıqla təmizlənmək, hamarlanmaq. *Kəsilmiş gövdələr tamamilə dırmıqlanıb qotmanlara yığılmalıdır.* "Pambıqçılıq".

**DIRNAĞAOXŞAR** b a x **dırnaqşəkilli**.

**DIRNAQ** *is.* 1. Barmaqların ucunun üst tərəfində sümük kimi maddədən ibarət örtü. *Dırnaq tutmaq. Dırnaq şotkası* (*dırnaqları təmizləməyə məxsus kiçik şotka*). // At, inək kimi heyvanların ayaqlarının alt hissəsini əhatə edən bütöv və ya haça şəklində buynuz maddə. [Balaxanım Dadaşa:] *Hələ mən səni öz atımın dırnaqları altında tapdadanda tamaşa elə, Dadaş Lələşov!* S.Rəhimov. *Dırnağilə bəzək vurub nəmli torpağa; Qoyun-quzu mələşərək qalxır yaylağa.* S.Rüstəm.

2. Caynaq (quşlarda). □ **Dırnaq ilişdirmək (keçirmək)** – tutmaq, çənginə keçirmək, yapışıb buraxmamaq.

3. *dilç.* « » və ya " " işarəsi olub, mətn daxilində vasitəsiz nitqi, sitatları, əsər adını, başlıqları, ayrı-ayrı sözləri, həmçinin şərti və ya əks mənada işlənən sözləri bildirmək üçün işlənir. □ **Dırnaq arasında (içində)** – b a x **dırnaqarası**. *Kobud dedim, kobudluq yerində xoşa gəlir; İşlədirəm bu sözü mən dırnaq arasında.* S.Rüstəm.

◊ **Dırnağı bərk olsun!** – təzə alınan at üçün deyilən xeyirxahlıq ifadəsi. **Dırnağı qayım olsun!** *etnoqr.* – təzə gəlin üçün edilən xeyir-dua. **...dırnağı da ola bilməz (deyil)** – müqayisələrdə birinin digərindən çoxçox aşağı, dəyərsiz, ləyaqətsiz olduğunu bildirir. [Vəli:] *A balam, sən özünə artist deyirsən? Sən yüz il qanqal otlayasan, Mazandaranskinin bir dırnağı ola bilməzsən.* Ə.Haqverdiyev. **Dırnağı ilə** (**çalışmaq** və s.) – ağır zəhmət və çətinliklə. *Sən süngünlə, dırnağınla yer altından yol açarsan; Sən qaranlıq küçələrə gözlərindən nur saçarsan.* S.Vurğun. **Dırnaq qədər** – əsla, qətiyyən, heç. [Mindilli:] *Siz bu hadisələrə bir dırnaq qədər də fikir verməyin.* S.Rəhman. **Dırnaq yeri axtarmaq** – girəvə, bəhanə axtarmaq. **Dırnaq göstərməyən (sızmayan)** – xəsis. **Dırnaq ovuca batmaq** – 1) bilmədən özü öz işini korlamaq; 2) özünə güvənmək. **Ətlə dırnaq arasına girmək** – b a x **ət**. **Təpədən dırnağa (qədər)** – b a x **təpə**.

**DIRNAQARASI** *sif. dan. isteh.* Verilən ada layiq olmayan, yalançı əsli olmayan, qeyri-həqiqi. *Dırnaqarası alim.*

**DIRNAQBAĞASI** *is.* Dırnaqlı heyvanların dırnağında baş verib onun qırışmasına, büküşməsinə səbəb olan xəstəlik.

**DIRNAQCIQ** *is.* 1. Kiçik dırnaq.

2. Yarpağın getdikcə daralan hissəsi. *Sərbəst tac yarpağının geniş hissəsi aya, dar hissəsi isə dırnaqcıq adlanır.* M.Qasımov. [Turuncarın] *ləçəklərinin dırnaqcığı uzundur. Meyvəsi silindrşəkilli buynuz tiplidir.* H.Qədirov.

**DIRNAQDİBİ** *is. dan.* Dırnağın dibinin iltihabı və irinləşməsi; dolama. *Barmağına dırnaqdibi çıxıb.*

**DIRNAQLAMA** "Dırnaqlamaq"dan *f.is.*

**DIRNAQLAMAQ** *f.* 1. Cırmaqlamaq. *Pişik uşağın əlini dırnaqlayıb.*

2. Dırnaqla yeri eşmək, dırnaqla bir şeyi cızmaq, yaxud əzmək.

**DIRNAQLANMA** "Dırnaqlanmaq"dan *f.is.*

**DIRNAQLANMAQ** *f.* 1. Cırmaqlanmaq, dırnaqla cızılmaq.

2. *qayıd.* Dırnaqla qaşınmaq.

**DIRNAQLAŞMA** "Dırnaqlaşmaq"dan *f.is.*

**DIRNAQLAŞMAQ** *qarş*. Bir-birini dırnaqla cırmaqlamaq; cırmaqlaşmaq.

**DIRNAQLI** *sif.* 1. Dırnağı olan. *Dırnaqlı heyvanlar. Çatal dırnaqlı qoyun və keçi*.

2. *məc. dan*. Qoçaq, bacarıqlı, hünərli. // *məc.* Yapışanda buraxmayan, çənginə keçəni buraxmayan.

**DIRNAQLILAR** *is. zool*. Dırnaqlı məməlilər dəstəsi. *Dırnaqlılar dəstəsinə bitki ilə qidalanan və ayaqlarında mal dırnaqları olan iri məməlilər aiddir. Dırnaqlılar yerdə qaçan heyvanlardır.* "Zoologiya".

**DIRNAQSIZ** *sif.* Dırnağı, ya dırnaqları olmayan, dırnağı düşmüş. *Dırnaqsız barmaq*.

**DIRNAQŞƏKİLLİ** *sif.* Şəkilcə dırnağa oxşayan, dırnaq şəklində olan.

**DIRNAQTUTAN** *is.* Dırnaq kəsmək üçün alət. *Bu zorba bıçağın üç-dörd tiyəsi, qayçısı, dırnaqtutanı, vintburanı vardı.* M.Hüseyn.

**DIŞ** *is.* Xaric, bayır, dışarı.

**DIŞARI** *is.* Bayır, çöl, eşik. *Dışarı baxmaq. – Qızıl Arslan Səba xanımın saraydan dışarı çıxdığı zaman heç kəsə bildirmədən həbsə alınmasını və edam edilməsini tapşırmışdı.* M.S.Ordubadi.

**DIZ-DIZ, DIZZ** *təql.* 1. Arıların, çibinlərin, yaxud qaynamaqda olan samovarın çıxardığı səs.

2. Birinə yanıq, acıq verəndə çıxarılan səs. [Qaraca qız:] *Dızz, qara köpək, dızz, necəsən, tuta bilmədinmi, – deyə qara köpəyə yanıq verirdi.* S.S.Axundov.

**DIZIXMAQ** *f. dan*. Sürüşmək, əkilmək, aradan çıxmaq, qorxub qaçmaq. *Kədxuda üstünə qara yaxdılar; Sözlərin danışıb tez dızıxdılar.* Q.Zakir.

**DIZILDAMAQ** *f.* Dızıltı səsi çıxarmaq. *Samovar xoş bir ahənglə dızıldayır.* Ə.Sadıq.

**DIZILTI** *is.* Dız-dız səsi. [Ovçu Qasım:] *Gördüm kolun altında bir kor sərçə oturub, arının dızıltısını eşitcək ağzını ayırdı və arı buğdanı onun ağzına buraxıb getdi.* Ə.Haqverdiyev. *Sonra dedim: – ..Bu nə dızıltıdır belə; Pəncərə şüşəsində vurnuxur tək bir çibin.* R.Rza.

**DIZQAX** *is. məh*. Bitki bitirməyən, məhsul verməyən yer.

**Dİ** *əd.* 1. Təkid, əmr, ya xahiş bildirir. *Di, yaz! Di, tez ol! Di, gəl çıx! – Di, yumma gözlərini, qoy görüm doyunca barı*. X.Natəvan. *Toplayıb bir dəstə çiçək; Di, gəlin məktəbə gedək.* Ə.Cavad. *Odur, qızım, – deyə qarı yavaşdan pıçıldadı. – Di, dur!* Ə.Məmmədxanlı.

2. Təəccüb, narazılıq bildirir. *Di gör, nə deyir. Di gəl, gör nə danışır.*

◊ **Di gəl, di gəl ki...** – amma, lakin, halbuki. *...İndi hökumət bizə, tutaq ki, elə izin verdi ki, ana dilimiz məktəblərdə oxunsun. Amma, di gəl ki, müəllim hanı?* C.Məmmədquluzadə. *Balaca qız uşağıdı. Di gəl ki, qüdrətdən buna elə bir məlahətli səs verilib ki, deyirsən, yeməyim, içməyim, oturum, qulaq asım.* Mir Cəlal.

**DİABÉT** [*yun.*] *tib.* Çoxlu sidik ifrazı şəklində təzahür edən bir sıra xəstəliklərin adı. ☐ **Şəkər diabeti** – başlıca əlaməti sidikdə və qanda şəkərin çoxalmasından ibarət olan xəstəlik; şəkər xəstəliyi. *Yağlı-yavan, nə düşdü, yeyirsən iştahla sən; Nə diabet eşidib, nə min yara bilirsən..* R.Rza.

**DİABETLİ** *sif.* və *is. tib.* Şəkər xəstəliyi olan (adam).

**DİAFRÁQMA** [*yun.*] 1. *anat*. Döş boşluğu ilə qarın boşluğu arasında olan pərdə. *Heyvanın qarın boşluğu ilə döş boşluğu arasında nazik əzələlərdən ibarət bir pərdə vardır, bu, onun diafraqmasıdır.* C.Cəbrayılbəyli.

2. Optik cihazlarda: daxil olan işıq şüalarını azaldıb-çoxaltmaq üçün dairəşəkilli pərdəcik. *Fotoaparatın kamerasına düşən işığın miqdarı diafraqma vasitəsilə nizama salınır.*

**DİAFRAQMALI** *sif. xüs*. Diafraqması olan.

**DİAKRİTÍK** *sif.* [*yun.*] *dilç*. Hərflərin üstündə və ya altında qoyulan. ☐ **Diakritik işarə** – hərfin altında və ya üstündə olan və tələffüzü göstərən işarə.

**DİAQNÓST** [*yun.*] *tib.* Diaqnozu düzgün təyin edən həkim (b a x **diaqnoz**). *O həkim yaxşı diaqnostdur.*

**DİAQNOSTÍK** *sif.* [*yun.*] *tib.* Diaqnoza, diaqnostikaya aid olan, xəstəliyin xüsusiyyətini bildirən. *Diaqnostik üsullar. – ..Diaq-*

*nostik məqsədlərlə hazırda, tərkibində dəqiq indikatorlar olan izotoplar daxil edilmiş bəzi birləşmələr işlədilir.* A.Qarayev. *Dərman bitki materiallarında bir sıra müxtəlif diaqnostik nişanələr olur.* R.Əliyev.

**DİAQNÓSTİKA** [*yun.*] Tibbin, xəstəliklərin əlamətlərindən, diaqnoz qoyma üsul və prinsiplərindən bəhs edən şöbəsi. // Diaqnozu müəyyən etmə, diaqnoz qoyma (qoyulma). *..Rentgen şüaları fotoqrafiyada və bəzi xəstəliklərin diaqnostikasında tətbiq edilməklə bərabər, müalicə məqsədi ilə də işlədilə bilər.* A.Qarayev. *Diaqnostika işlərində radioaktiv fosforun rolu çox böyükdür.* R.Əliyev.

**DİÁQNOZ** [*yun.*] *tib.* Xəstəni hərtərəfli müayinə nəticəsində onun xəstəliyinin müəyyən edilməsi. *Əziz əlini ürəyinin üstünə qoyandan sonra həkim diaqnozunun dürüstlüyünə daxilən sevindi.* Ə.Vəliyev. *Mənim gümanım gələn bir diaqnozu bu gün yoxlamaq istəyirəm.* Mir Cəlal. □ **Diaqnoz qoymaq** – xəstəni hərtərəfli müayinə edərək onun xəstəliyini təyin etmək. *Uranla zəhərlənmələrin diaqnozunu qoymaq üçün sidikdə albuminlərin, amin turşularının tapılmasının .. böyük əhəmiyyəti vardır.* A.Qarayev.

**DİAQONÁL** [*lat.* əsli *yun.*] 1. *riyaz.* Çoxbucaqlının və ya çoxüzlünün yanaşı olmayan təpələrini birləşdirən düz xətt. *Dördbucaqlının diaqonalı.*

2. Toxuma milləri çəpinə gedən sıx parça növü. // Bu parçadan tikilmiş. *Diaqonal şalvar. Diaqonal kostyum.*

**DİAQRÁM** [*yun.*] Müxtəlif kəmiyyətlər arasındakı nisbəti göstərən qrafik təsvir; cədvəl. *Neft sənayesinin artım diaqramı. – O, diaqramlarla kifayətlənməyib .. öz fikrini əyani surətdə göstərirdi.* M.Hüseyn. *Əhmədov divardakı cədvəllərə, diaqramlara baxırdı.* Mir Cəlal.

**DİALÉKT** [*yun.*] *dilç.* 1. Yerli şivə, ləhcə. *Məhəlli dialekt. Bakı dialekti.*

2. B a x **dialektal**. *Dialekt sözləri.*

**DİALEKTÁL** *sif.* [*yun.*] *dilç.* Dialektə aid olan, dialekt mahiyyətində olan. *Dialektal ifadə. Dilin dialektal xüsusiyyəti.*

**DİALÉKTİK** *is.* [*yun.*] *fəls.* Dialektik fəlsəfə tərəfdarı, dialektik üsul tətbiq edən (*metafizik* əksi).

**DİALEKTÍK** *sif.* [*yun.*] *fəls.* Dialektikaya aid olan, dialektika qanunlarına əsaslanan, metafizikaya zidd olan. *Dialektik fəlsəfə. Dialektik təfəkkür. Dialektik üsul. Dialektik materializm.*

**DİALÉKTİKA** [*yun.*] 1. *fəls.* Təbiət, cəmiyyət və təfəkkürün hərəkət, dəyişmə, təzələnmə və inkişafının ümumi qanunlarından bəhs edən elm. *Materialist dialektika.*

2. *fəls.* Bir şeyin hərəkət və inkişaf prosesi. *Hadisələrin dialektikası. Tarixin dialektikası.*

3. *köhn.* Mübahisə aparmaq məharəti, qarşı tərəfin mühakimələrində ziddiyyət tapmaq, mübahisədə məntiqi dəlillər gətirə bilmək bacarığı. *Mübahisə zamanı* [Rudin] *öz rəqibinə danışmağa az fürsət verər və onu öz sürətli və coşqun dialektikası ilə məğlub edərdi.* Turgenevdən.

**DİALEKTÍZM** [*yun.*] *dilç.* Dialektdən ədəbi dilə keçmiş məhəlli söz və ya ifadə. *Yazıçının dilində təsadüf edilən dialektizmlər.*

**DİALEKTOLÓGİYA** [*yun.* dialekt və logos – elm, anlayış] *dilç.* Dilçiliyin, dildə olan dialektləri (ləhcə və şivələri) öyrənən şöbəsi.

**DİALEKTOLOJÍ** *sif.* [*yun.*] *dilç.* Dialektologiyaya aid olan. *Dialektoloji xəritə. Dialektoloji ekspedisiya. Dialektoloji atlas.*

**DİALEKTÓLOQ** [*yun.* dialekt və logosdan] *dilç.* Dialektologiya mütəxəssisi olan dilçi. *Azərbaycan dialektoloqlarının əsərləri.*

**DİALOJÍ** *sif.* [*yun.*] Dialoq mahiyyətində olan, dialoq (mükalimə) şəklində olan.

**DİALÓQ** [*yun.*] Ədəbi əsərin, iki şəxsin söhbəti şəklində yazılmış hissəsi; mükalimə. *Sabirin "Əhvalpürsanlıq" dialoqu. – O, bu ilk dialoqda Hüseynin füsunkar səsindən sehirlənmişdi.* S.Rəhman.

**DİAMÁT** [dialektik materializm *söz. ixtisar forması*] *dan.* Dialektik materializm (ali məktəbdə keçilən fənn). *Diamat müəllimi. Diamatdan imtahan vermək.*

**DİÁMETR** [*yun.*] *riyaz.* Çevrənin mərkəzindən keçib onu iki bərabər hissəyə bölən düz xətt. // Dairəyə, yaxud dairəyə oxşar

şəkildə olan cisim və ya sahənin kənarlarındakı qarşılıqlı nöqtələr arasındakı məsafə. *Ağacın gövdəsinin diametri bir metrdir. Borunun diametri.*

**DİAMETRÁL** *sif.* [*lat.* əsli *yun.*] Diametr xətti ilə ortadan bölən, ya bölünən. *Diametral səth*.

**DİAMETRLİ** *sif.* Diametri müəyyən ölçüdə olan. *10 mm diametrli boru.*

**DİAPAZÓN** [*yun.*] 1. *mus*. Hər hansı bir müğənninin, yaxud musiqi alətinin malik olduğu müxtəlif yüksəklikdə olan səslərin məcmusu. *Müğənninin səs diapazonu böyükdür. – Nəğməkarların və ya musiqi alətlərinin ən bəm səsdən ən zil səsə qədər malik olduğu ümumi həcminə diapazon deyilir.* Ə.Bədəlbəyli.

2. *məc*. Bir şeyin həcmi, ölçüsü, dərəcəsi, qavrama dairəsi. *Bilik diapazonu.*

**DİAPAZONLU** *sif.* Müəyyən diapazonu olan.

**DİAPOZİTÍV** [*yun.* dia – vasitəsilə və *lat.* positivus – müsbət] *fot.* Proyeksiya fənəri vasitəsilə göstərilmək üçün şüşə və s. üzərinə salınmış şəkil.

**DİASPOR** *is.* [*yun.*] Xalqın mənsub olduğu ölkədən kənarda yaşayan mühüm hissəsi.

**DİATERMÍYA** [*yun.*] *tib.* Yüksək təzyiqli elektrik cərəyanı ilə müalicə üsulu.

**DİATÉZ** [*yun.*] *tib*. Orqanizmin bəzi xəstəliklərə meyilliyi.

**DİATONİK** *sif.* [*yun.*] *mus.* Ardıcıl surətdə ladın bir pərdəsindən digərinə keçən, yaxud yerləşən. *Diatonik qamma* (*bütöv və yarımtonlardan ibarət səslərin ardıcıl sırası*). *– Avropa musiqisində olduğu kimi, Azərbaycan musiqisində də oktava 7 diatonik və 12 xromatik pərdədən ibarətdir.* Ü.Hacıbəyov.

**DİB** *is.* 1. Dəniz, çay, kol və s. suyunun altındakı torpaq səthi. *Görünməz olmuşdur dənizin dibi; Qayıq yırğalanır bir beşik kimi.* S.Vurğun. *Sanki qalxmaq istəyir göyə dənizin dibi.* R.Rza. *Qoca, avarı suyun dibinə dayayıb, ayaqları ilə gəmini itələdi və yuxarıya doğru sürdü.* M.Hüseyn. // Çuxur yerlərin ən aşağı hissəsi, alt səthi. *Çalanın dibi. Xəndəyin dibi. Səngərin dibi. – Dərin, darısqal dibində dərənin; Rəd kimi guruldayır baltalar.* A.Səhhət. *Dərələrin dibində uşaq ağlayır, bu səslər çoxalıb bir-birinə qarışır, gündüz mərəkəsinin həyat mahnısı çalınırdı.* Mir Cəlal. // Bir qab və s.-nin alt səthi, alt divarı. *Stəkanın dibi. Bardağın dibi. Kisənin dibi. – Sikkə olmaz övladımın cibində; Rizqləri yırtıq çuval dibində..* Q.Zakir. *Köhnə boz xaralın dibində üç-dörd kiloqram qarğıdalı vardı.* Ə.Vəliyev.

2. Ağac, kol və s.-nin altı, kökə yaxın yeri. *Ağacı* (*kolu*) *dibindən kəsmək. – Bənövşəyəm, mən tərəm; Kol dibində bitərəm.* (Bayatı). *Əhməd daş yoldan kənar çıxıb bir kolun dibində gizləndi.* Ə.Vəliyev. *Firidun dayandığı yerdə ağac dibinə sindi.* Mir Cəlal. // Taya, divar və s.-nin yerin səthi ilə birləşən ən aşağı hissəsi. *Divar dibində xoruz, toyuqlar uyqular; Naxırçılar qaramalı sürüb sərin suya salar.* A.Səhhət. *Student divarın dibinə çəkildi, bir də otağa diqqətlə baxmağa başladı.* Çəmənzəminli. *Kimsə hasar dibi ilə irəliləyirdi.* Ə.Məmmədxanlı. // Bir şeyin bilavasitə yanı, yaxınlığı. [Dadaş Ləleşov:] ..*Görəsən, Solmaz hansı segah oxuyan samovarın dibini kəsib çay qaynadacaqdır?* S.Rəhimov. *Rüstəm kişi samovarın dibindən tərpənmirdi.* M.İbrahimov.

3. Qulaq, buynuz, diş və s.-nin bədənlə birləşən və ətin içində olan hissəsi. *İnək qoca idi. Bir buynuzu da dibindən qırılmışdı.* C.Məmmədquluzadə. *Ənvər Rəsulov qulağının dibini qaşıdı.* Ə.Vəliyev. *Qüdrətin qulağının dibindən tutmuş açıq boynuna qədər qırmızı bir zolaq uzanır..* M.İbrahimov.

4. Bir yerin ən uzaq, ən dərin, ən arxa tərəfi. ..*Dadaşım əlimdən yapışıb məni çəkəçəkə apardı həyatin dibinə.* C.Məmmədquluzadə. *Çayxananın dib tərəfində oturmuş çeşməkli oğlan Xalıqverdiyə xüsusi nəzər saldı.* Ə.Vəliyev.

5. Qazanın və s.-nin dibində qalan xörək və s. *Südün dibi. Aşın dibi.*

◊ **Dibinə daş atmaq** – axırına çatmaq, işlədib, sərf edib qurtarmaq.

**DİBA** *is.* [*fars.*] *klas.* Zərli gülləri olan ipək parça. // *Sif. mənasında.* Həmin parçadan tikilmiş. *Xoş yaraşır sənə diba nimtənə; Bu bəzəyin yeni əlaməti var.* M.P.Vaqif. *Diba nimtənəli, tikmə köynəkli; Yaşıllı, zərbaflı, allı sənəm, gəl!* Xəstə Qasım.

**DİBAÇƏ** *is.* [*fars.*] *ədəb.* 1. Keçmişdə: kitabın qızıl suyu ilə nəqşlərlə bəzənmiş müqəddiməsi, ilk səhifələri.

2. Giriş, müqəddimə. *Füzuli divanının "Dibaçə"si.* // Məc. mənada. [Mirzə Fətəli:] *Sözünü buyur, dibaçə lazım deyil.* Ə.Haqverdiyev.

**DİBCİK** *is.* Tüfəng qundağının döşə dirənən enli hissəsi. *Tüfəngin dibciyi. – Dibcik qısdı məməsinə, körpə ayaqlı Çin qadınları.* R.Rza.

**DİBÇƏK** *is.* İçinə torpaq tökülərək gül, kol və başqa bitkilər əkilən qab. *Gül dibçəyi. Saxsı dibçək. – Əhməd durub o biri otağa keçdi, hər əlində bir dibçək qayıtdı..* S.Rəhimov. *Divarlar şəkillərlə bəzənmiş, pəncərələrə gül dibçəkləri düzülmüşdü.* Ə.Sadıq.

**DİBÇƏKVARİ** *sif.* Dibçək kimi, dibçəyə oxşar. *Dibçəkvari qab.*

**DİBDƏNÇIXMA** *sif.* Budaqsız çubuq, zoğ, şiv. *Dibdənçıxma çubuq.*

**DİBDƏNDÜŞMƏ** *sif.* Tağların diblərinə yaxın qismində əmələ gələn meyvə, məhsul. *Dibdəndüşmə xiyar.*

**DİBDOLDURAN** *is. k.t.* Bitkilərin dibini torpaqla dolduran alət və s. *Suvarma şırımları açmaq üçün kultivatora dibdolduranlar qoşulur.* "Pambıqçılıq". // Sif. mənasında. *Dibdolduran alət.*

**DİBƏK** *is.* 1. Daş, ya ağacdan böyük həvəng. *Qəhvəni dibəkdə döyərlər. – Haman daş, haman dibək.* (Ata. sözü).

2. Buğda və çəltik döymək üçün yerdə qazılmış kiçik çuxur. *Dibəkdə düyü döymək.*

**DİBİR** *is. məh.* Təsbəhlərdə olan uzunsov muncuq dənəsi.

**DİBİYASTI** *sif.* Dib səthi yastı olan.

**DİBLİ** *sif.* Dibi olan. *Dibli çəllək.*

**DİBLİK** *is.* Altı olan şeylərin dib hissəsi.

**DİBÖLÇƏN** *is. xüs.* Çayın, gölün, dənizin dərinliyini ölçmək üçün cihaz.

**DİBSİZ** *sif.* 1. Dibi olmayan. *Dibsiz çəllək. – Dibsiz kisə – boş anbar.* (Ata. sözü).

2. *məc.* Dibi çox uzaqda olan, dibi görünməyən, çox dərin. *..Sel dibsiz bir uçuruma doğru axıb gedir.* M.İbrahimov.

3. *məc.* Sonsuz, sonu olmayan, ucsuz-bucaqsız. *Dibsiz göy. – Çamırlı yerdən qalxan buxar .. dibsiz fəzanın dərinliklərinə uçub getdi.* M.Hüseyn.

**DİDAKTİ́K** *sif.* [*yun.*] Təlimverici, öyüdverici, nəsihətverici, tərbiyə məqsədi daşıyan. *Didaktik roman. Didaktik hekayə.*

**DİDÁKTİKA** [*yun.*] Pedaqogikanın təlim və tərbiyə üsullarından bəhs edən şöbəsi. *Yazı lövhələri də didaktikanın tələblərinə cavab verə bilmir.* M.İbrahimov.

**DİDAR** *is.* [*fars.*] *klas.* 1. Görünüş, üz, sifət, zahiri sima. *Doymaq olmaz didarından bir zaman; Tamaşası, qaşı-qabağı şirin.* M.P.Vaqif. *Xandostu, amandı, qoyma gəldi! Didarı yamandı, qoyma, gəldi!* M.Ə.Sabir. // Üz, çöhrə; gözlər (çox zaman gözəl haqqında). *Yar olan yerdə nədir xublərin didarı.* S.Ə.Şirvani. *Tale yarı yardan aralı saldı; Öksüz ruhum didarə həsrət qaldı.* H.Cavid.

2. Görüş, görmə. *Ümidim çox idi yetəm didarə; Deyəm ərzi-halı o nazlı yarə.* Ə.Nəbati. [Fərman:] *Didarın mənə müyəssər olmadı. İndi sənə ən yaxın olan köynəyinə baxıb .. vida edirəm.* Ə.Haqverdiyev.

**DİDDİRMƏ** "Diddirmək"dən *f.is.*

**DİDDİRMƏK** "Didmək"dən *icb.*

**DİDƏ** *is.* [*fars.*] *klas.* Göz. *Gər inanmazsan ki, qəmzən yıxdı könlüm şəhrini; Bəs bu fəryadım nədəndir, didə qandan nəm durur?* Nəsimi. *Ağla, didəm, qanlı yaşın sel olsun; Gizlin dərdin söyləməyə dil olsun.* M.V.Vidadi. *Kim səni didəsi giryan eləmiş? Kim səni halı pərişan eləmiş?* A.Səhhət. ☐ **Dideyi-giryan** *klas.* – ağlar göz. *Həqq bilir, yar deyil canü-dilimdən qaib; Nola gər qaib isə dideyi-giryanımdan.* Füzuli. *Parə-parə ciyərim şişə çəkib etdi kəbab; Dikdi göz dideyi-giryanıma göyçək-göyçək.* Ə.Nəbati. *Ağladım hicrinə, biganəni güldürdü mənə; Baxmadı dideyi-giryanıma, gözdən düşdüm.* Ə.Vahid.

**DİDƏLƏMƏ** "Didələmək"dən *f.is.*

**DİDƏLƏMƏK** *f.* Xırda-xırda, parça-parça qoparmaq. *Daramaq üçün yunu didələmək.*

**DİDƏRGİN** *sif.* Yurdundan, vətənindən məhrum olaraq başqa yerlərdə dolaşan; sərgərdan, dərbədər. *Firqətindən əlim getməz bir işə; Gəzirəm didərgin* (z.) *səyyad misli.* Aşıq Əli. ☐ **Didərgin düşmək (olmaq)** – yurdundan, vətənindən məhrum olaraq

başqa yerlərdə dolaşmaq, dərbədər olmaq. [Bədəl:] *Bizim kimi evindən- eşiyindən didərgin düşənlər çoxdur..* Ə.Haqverdiyev. *Türkdilli xalqların doğma yerindən; Didərgin düşməsi kimə gərəkmiş?* B.Vahabzadə. **Didərgin salmaq** – yurdundan, vətənindən uzaq salmaq, dərbədər salmaq. *Vətənim var idi, nə etməli, didərgin saldılar, mən də onu unutdum.* A.Divanbəyoğlu. [Sabir:] *Məni öz vətənimdən didərgin salıblar.* M.Hüseyn.

**DİDƏRGİNLİK** *is.* Didərgin adamın hal və vəziyyəti, didərgin olma.

**DİDİK** *sif.* Didilmiş halda olan. *Didik yun. Didik ət. Didik gündə.*

**DİDİK-DİDİK** *sif.* Çox didilmiş, hər yeri didilmiş, çox xırdalanmış, tikə-tikə qoparılmış, çox yırtılmış. *Didik-didik quyruq. Didik-didik parça.* ☐ **Didik-didik edilmiş** – b a x **didiklənmiş**. *Ortalıqda didik-didik edilmiş soyutma toyuq əti vardı.* Ə.Əbülhəsən. **Didik-didik etmək (eləmək)** – didilmiş hala salmaq. *Pişik bir tərəfdən, göyərçin bir tərəfdən qarını didik-didik elədilər.* (Nağıl). *Zamanın bədənini quşlar didik-didik edib qan ilə əlvan etdilər.* Çəmənzəminli.

**DİDİKLƏMƏ** "Didikləmək"dən *f.is.*

**DİDİKLƏMƏK** *f.* Xırda-xırda parçalara ayırmaq, parça-parça qoparmaq; lif-lif, sap-sap ayırmaq. *Toyuq didikləmiş kündələr.*

**DİDİKLƏNMƏ** "Didiklənmək"dən *f.is.*

**DİDİKLƏNMƏK** *məch.* Didik-didik edilmək.

**DİDİKLƏNMİŞ** *f.sif.* Xırda-xırda parçalara ayrılmış, didik-didik edilmiş; didik-didik.

**DİDİLMƏ** "Didilmək"dən *f.is.*

**DİDİLMƏK** *f.* 1. Didik hala gəlmək, didik-didik olmaq, lif-lif, tel-tel ayrılmaq, dağılmaq, yıpranmaq. *Paltarı didilmək. – Didilməkdən çuxamda da bir sağ tikə qalmamışdı.* S.Rəhimov. *Döşəklərin yunu çırpılır, didilir və təzədən salınır.* Ə.Abasov.

2. Zülmə, işgəncəyə, məhrumiyyətə məruz qalmaq. *Vaxtilə fanatizm pəncəsində didilən insanların həyatı artıq təzələnməkdə idi.* S.Şamilov. // *məc.* Mənəvi əzab və iztirab çəkmək, parça-parça olmaq; xırpalanmaq. *Zavallı Gülzar bunları eşidir, bütün ürəyi didilir, bütün varlığı parçalanırdı.* C.Cabbarlı. [Gülnaz] *ananın nələr çəkdiyini, qəlbinin parça-parça didilib dağıldığını bilmədi..* M.İbrahimov.

**DİDİM-DİDİM** b a x **didik-didik**. ☐ **Didim-didim didmək (etmək eləmək)** – didik-didik etmək, tikə-tikə etmək, parça-parça etmək, didib dağıtmaq, didmək. *..Dövlətlə Şahbəy həzrətin qollarını bağladılar və əgər Şahbəy olmasaydı, arvadlar onu didim-didim didərdilər!* Ə.Əbülhəsən. // *məc. mənada*. [Aydın:] *Ox, Surxay, şübhə məni öldürür, bütün ürəyimi didim-didim didir.* C.Cabbarlı. *Evdə xanım Balacayevanın gözətçiliyi, burada da belə iti dırnaqların uzanması onun ürəyini didim-didim elədi.* S.Rəhimov.

**DİDİNMƏ** "Didinmək"dən *f.is.*

**DİDİNMƏK** *qayıd.* Bərk qaşınmaq.

**DİDİNTİ** *is.* Yun didilməsindən sonra qalan xırda qırıntılar.

**DİDİŞDİRİLMƏ** "Didişdirilmək"dən *f.is.*

**DİDİŞDİRİLMƏK** "Didişdirmək"dən *məch.*

**DİDİŞDİRMƏ** "Didişdirmək"dən *f.is.*

**DİDİŞDİRMƏK** *qarş.* 1. Hərə bir tərəfdən didmək.

2. *məc.* İncitmək, əziyyət vermək, dinc qoymamaq. *Yapışıb əllərilə başının saçlarından; Didişdirir yun kimi, beyninə sıçrayır qan.* S.Vurğun.

3. Dartışdırmaq. *Həmzə Zeynalın səsindən ürkərək, çal bığını didişdirməyə başladı.* Ə.Əbülhəsən.

4. Bir-birini rahatsız etmək, bir-birinə macal verməmək. *Uşaqlar bir-birini didişdirə-didişdirə* (z.) *təkidlə soruşdular..* S.Rəhimov.

**DİDİŞMƏ** 1. "Didişmək"dən *f.is.*

2. *is. məc.* Dava, qovğa, çəkişmə, çeynəşmə, boğuşma. *İki qardaş arasında olan didişmələr get-gedə uzandı.* A.Şaiq. ☐ **Didişmə düşmək** – vuruşma, döyüşmə baş vermək, qovğa düşmək; // bir-birinə macal verməmək, boğuşma düşmək, bir-birini didmək, didişmək. [Əmiraslan baba:] *Çərçilərin xurcunlarından bir sırıq bafta, ya bir top güləbətin çıxanda qız-gəlin toplaşar, bir didişmə düşərdi ki, gəl görəsən.* S.Rəhimov.

**DİDİŞMƏK** *qarş.* Bir-birini didmək, bir-biri ilə vuruşmaq, dalaşmaq, söyüşmək, çəkişmək, çeynəşmək, boğuşmaq. *Bir-biri ilə*

*didişmək. – İki qartal dağın təpəsində .. qəzəblə didişirdi.* Ə.Sadıq.

**DİDİŞMƏSALAN** *is.* Araya didişmə (dava, qovğa, çəkişmə) salan adam.

**DİDMƏ** "Didmək"dən *f.is.*

**DİDMƏK** *f.* 1. Yun, pambıq və s.-ni xırda hissələrə ayırmaq, lif-lif ayırmaq, tel-tel ayırmaq. *Səlimnaz arvad təzə yorğan salmaq üçün yun didirdi.* M.Hüseyn.

2. Dimdiyi ilə parça-parça etmək, qoparmaq, dağıtmaq, ovub çıxarmaq (quşlar haqqında). *Qarğalar leşi didirlər. – Dilin olmasa, gözünü qarğalar didər.* (Ata. sözü). *Ovlayıb öz şikarını uçaraq; Qonur, orda didib yeyir çalağan.* A.Səhhət. // Dırnağı, dişi və s. ilə parça-parça etmək, tikə-tikə etmək, doğrayıb tökmək. *O, əlindəki bir parça kağızı dişi ilə didib vaqona püfləyirdi.* M.S.Ordubadi. // *məc.* Ruhi əzab vermək, iztirab vermək, incitmək; xırpalamaq. [Hacı Murad:] *Hərəniz bir tərəfdən soxulub cəmdəyimi didirsiniz.* S.S.Axundov. [İncə:] *Onun görkəmi ürəyi didir.* C.Cabbarlı. *Bildilər o zaman Hacı bəhərçin; Didəcək onları qurddan da betər.* H.K.Sanılı. ◻ **Bir-birini didmək** – vuruşmaq, dalaşmaq, çeynəşmək, boğuşmaq, didişmək. [Məsmə:] *Orda adamlar bir-birini didirmişlər.* Mir Cəlal.

3. Cırmaqlamaq, saçlarını yolmaq. *Gülnaz əlləri ilə* [Məmmədin] *üzünü, gözünü didir, çırpınıb çıxmağa can atırdı.* M.İbrahimov. *Gülüş iti dırnaqları ilə Məmişin üz-gözünü didməyə başladı.* S.Rəhimov.

**DİDMƏLƏMƏ** "Didmələmək"dən *f.is.*

**DİDMƏLƏMƏK** *dan.* b a x **didikləmək**.

**DİFERENSİÁL** [*lat.*] 1. *riyaz.* Funksiyanın sonsuz kiçik artımının limiti. // Diferensiala aid olan. *Diferensial tənlik. Diferensial həndəsə.*

2. *iqt.* Bərabər olmayan, fərqli, müxtəlif dərəcələrə ayrılmış. *Diferensial renta. Diferensial tarif.*

**DİFERENSİÁSİYA** [*lat.*] Bir şeyin ayrı-ayrı müxtəlif ünsürlərə ayrılması, parçalanması, təbəqələşməsi.

**DİFFÚZ** *sif.* [*lat.*] *dilç.* Aydın olmayan, yayğın, qeyri-dəqiq. *Diffuz səslər.*

**DİFTERİTLİ** *sif.* [*yun.*] *tib.* Difterit xəstəliyinə tutulmuş. *Difteritli uşaqlar.*

**DİFTERÍYA, DİFTERÍT** [*yun.*] *tib.* Əsasən uşaqlarda baş verən yoluxucu boğaz xəstəliyi; boğma, inaq.

**DİFTÓNQ** [*yun.*] *dilç.* Bir hecada tələffüz edilən iki saitin birləşməsi.

**DİFTONQLAŞMA** *dilç.* "Diftonqlaşmaq"-dan *f.is.*

**DİFTONQLAŞMAQ** *f. dilç.* Diftonq əmələ gətirmək.

**DİFTONQLUQ** *is. dilç.* Diftonqdan ibarət olma, diftonq səsin halı.

**DİFTONQVARİ** *sif. dilç.* Diftonqa oxşayan, diftonqu xatırladan, diftonq mahiyyətində olan. *Diftonqvari səs.*

**DİGƏ** *is. məh.* Yayda yaylağa çıxarkən qoyunların bir müddət qaldıqları dağ ətəkləri. *Qoyunların digədən qalxmaları.*

**DİGƏR** *sif.* [*fars.*] Başqa, ayrı, o biri, ikinci. *Digər adamlar. Digər vaxtda. Digər fikrə görə.* // İs. mənasında. *Biri digərinə kömək etməlidir.* // Cəm şəklində: **digərləri** – başqaları, o biriləri.

**DİGƏRGUN** *sif.* [*fars.*] *klas.* Dəyişmiş, başqa halda. *Fərmanın haləti digərgun idi.* Ə.Haqverdiyev. ◻ **Digərgun eləmək (etmək)** – dəyişdirmək, pozmaq, pərişan etmək. *Dostumun bu pozğun halda və pərişan sifətdə olmağı mənə də artıq təsir edib, halımı digərgun və xarab elədi.* F.Köçərli. **Digərgun olmaq** – dəyişmək, pərişan olmaq.

**DİK** 1. *sif.* Aşağıdan yuxarıya doğru şaquli (düz) vəziyyətdə duran. *Dik ağac. Dik nərdivan. Dik divar.*

2. *sif.* Çox yüksək, uca, hündür; sarp. *Uzanan dik qayalar, silsilələr; Qara yellər ora dörd yandan əsər.* S.Vurğun. *Girdmanın igid sərkərdəsi meydanda dik bir yerdə görünərdi.* M.Hüseyn. *O kimdir; Aşır dik təpələri; Keçilməz yamacları?* M.Seyidzadə.

3. *zərf* Aşağıdan yuxarıya; dikinə, əmudi. *Dik çıxmaq. Ağacı dik qoy.* ◻ **Dik atılmaq (qalxmaq, durmaq)** – qorxu və ya başqa bir səbəb üzündən hövlnak ayağa qalxmaq, yerindən sıçramaq. *Atlar dik atılıb cilovu qırdı; Qoyunlar, quzular çöldə hürküşdü.* H.K.Sanılı. **Dik durmaq** – belini əymədən düz durmaq.

4. *is. mənasında.* Təpə, hündür yer, yoxuşluq, təpəlik. *Dikə çıxmaq. Dikdən enmək.*

– *Osman gözətçidir o yankı dikdə; Seyr edir baş-ayaq Nemsə düzünü.* H.K.Sanılı. *Şofer maşını ehtiyatla kol-kosla, çuxurlar və diklərlə yavaş-yavaş sürməyə başladı.* Mir Cəlal.

5. *sif.* Düz, tam. *Dik günorta Rüstəm gəlib, Mələk xanımı götürüb apardı padşahın yanına.* (Nağıl).

◊ **Dik baxmaq** – 1) gözlərini birinin gözlərinə dikərək diqqətlə baxmaq, gərgin bir baxışla baxmaq; 2) qürurla, cəsarətlə baxmaq. **Gözünün içinə,** yaxud **gözünə dik baxa bilməmək** – birinin yanında qüsuru, günahı olmaq, xəcalətli olmaq, xəcalət çəkmək. **Gözünün içinə,** yaxud **üzünə dik baxmaq** *məc.* – birinin yanında heç bir qüsuru, günahı, utanılacaq işi olmadığına görə özünü onun yanında tam sərbəst hiss etmək; **dik-dik: dik-dik baxmaq** – b a x **dik baxmaq** (**“dik”**də).

**DİKBAŞ** *sif.* və *is.* Çox təşəxxüslü, həddindən artıq iddialı, tərs (adam). *Dikbaş oğlan. – Qədirin də Poladdan ona görə xoşu gəlmirdi ki, Polad dikbaşdır..* Ə.Vəliyev. // Məğrur, söz götürməyən, itaət etməyən, boyun əyməyən. *..Dikbaş Azərbaycan illər uzunu Atabəylərə boyun əyməyə məcbur olmuşdu.* M.S.Ordubadi.

**DİKBAŞLIQ** *is.* Dikbaş adamın xasiyyəti; təşəxxüs. *Dikbaşlıq yaxşı xasiyyət deyil. Dikbaşlıq etmək.* // Məğrurluq, boyun əyməzlik.

**DİKBIĞ** *sif.* Bığları dik burulmuş. *Dikbığ cavanlar. – Dikbığ Dadaş öz sözünü əsaslandırmağa çalışdı.* S.Rəhimov.

**DİKBURUN** *sif.* 1. Burnunun uc tərəfi dik olan. *Sualı verən arıq, rəngi solğun, dikburun, dombagöz bir qız idi.* Ə.Əbülhəsən.

2. Burun tərəfi yuxarı qalxmış, burnu qalxıq (çəkmə və s.). *Çəkdilər burnuna qara yaşmağı; Ayaqda dikburun sarı başmağı.* H.K.Sanılı. *Laçın gah ayağındakı dikburun çarığa, gah da palçığa bulaşmış patavasına baxıb düşünürdü.* M.Hüseyn.

**DİKCƏ** *zərf* Bir qədər dik, dik halda. // Çox dik.

**DİKDABAN** *sif.* Dabanı dik, hündür. *Dikdaban çəkmə. Dikdaban başmaq.* – [Molla Qasım] *ayağına qara meşindən dikdaban Təbriz dübəndisi və bəzi vaxt sarı rəngli nəleyin geyərdi.* H.Sarabski.

**DİKDİR** *is.* Dik yer, kiçik təpə. *Muğan gözəli dikdirə çıxıb Xançobana yanaşdı.* İ.Əfəndiyev. *O biri tərəfdə isə yekə bir dikdir var idi.* Ə.Vəliyev.

**DİKƏLDİLMƏ** “Dikəldilmək”dən *f.is.*

**DİKƏLDİLMƏK** *məch.* 1. Dik hala gətirilmək, dik tutulmaq, yuxarı qaldırılmaq.

2. Yüksəldilmək, qaldırılmaq, dikilmək.

**DİKƏLMƏ** “Dikəlmək”dən *f.is.*

**DİKƏLMƏK** *f.* 1. Uzanmış və ya əyilmiş vəziyyətini dəyişib ayaq üstə durmaq və ya oturmaq, yerindən qalxmaq. [Məmməd] *Züleyxa və Balaxanım adını eşidər-eşitməz, papirosları yerdə qoyub dikəldi.* C.Cabbarlı.

2. Qalxmaq, başıyuxarı getmək. *Atlılar başıyuxarı dikəldilər.*

3. Yuxarı qalxmaq, çıxmaq. *Xudayar bəyin burnunun yuxarı tərəfindən bir sümük dikəlib.* C.Məmmədquluzadə.

4. *məc.* Düzəlmək, qurulmaq, bərqərar olmaq. [Salman:] *Rəhim qardaş, deyəsən, Bakıda təzə hökumət dikəlib, müsavat yıxıldı.* Ə.Haqverdiyev.

**DİKƏLTMƏ** “Dikəltmək”dən *f.is.*

**DİKƏLTMƏK** *f.* 1. Dik vəziyyətə gətirmək, dik tutmaq, dik qaldırmaq. [Rüstəm bəy:] *Mahmud, Mahmud!.. Başını bir az dikəlt..* N.Vəzirov. *Tüfəngimi dikəltdim, havada gəlirkən qolları arasından nişan aldım.* A.Şaiq. *At yalını qabartmış, quyruğunu dikəltmiş .. və kişnəyirdi.* S.Rəhimov.

2. *məc.* Ayaq üstə qaldırmaq, araya çıxarmaq, müstəqil hala gətirmək.

**DİKİLİ** *sif.* Dik halda olan, dik duran; dikəldilmiş.

◊ **Dikili ağacı yoxdur** – heç bir şeyə malik deyildir, heç bir şeyi yoxdur.

**DİKİLMƏ** “Dikilmək”dən *f.is.*

**DİKİLMƏK** *f.* Bir nöqtəyə baxmaq, gözünü çəkməmək, diqqətlə baxmaq. *Nə dikilib baxırsan?*

**DİKİNƏ** *zərf* Dik şəkildə, dik halda, başıyuxarı, aşağıdan yuxarıya. *Kərpici* (*daşı*) *dikinə qoymaq. – Kərimxanı yenə dikinə qaldırılmış bir qəbir təsiri bağışlayan kameraya atdılar.* M.İbrahimov. [Göyçək] *..kağızı çıxarıb üstündə dikinə bir cızıq çəkdi.* Ə.Əbülhəsən.

**DİKQULAQ** *sif.* Qulaqları dik duran. *Dikqulaq it.*

**DİKLƏMƏ** *zərf* Dikinə, başıyuxarı. [Uşaqlar] *dolama cığırla getmədilər, isti qum təpəsindən dikləmə yoxuşa qalxdılar.* Mir Cəlal.

**DİKLƏMƏK** *f.* 1. Dik qaldırmaq, dik hala salmaq, dik etmək. *İtlər quyruqlarını dikləyərək birdən-birə hürməyə, yüyürməyə başladılar.* A.Şaiq.

2. Tuşlamaq, yönəltmək, nişanlamaq. *Tüfəngi nişanəyə dikləmək.*

**DİKLƏNDİRMƏ** "Dikləndirmək"dən *f.is.*

**DİKLƏNDİRMƏK** *f.* Yuxarı qaldırmaq, dik hala gətirmək, qaldırıb dik qoymaq.

**DİKLƏNMƏ** "Diklənmək"dən *f.is.*

**DİKLƏNMƏK** bax **dikəlmək** 1 və 2-ci mənalarda. [Şeyx Nəsrullah] *bir qədər fikir eləyib baxır Hacı Həsənin üzünə və birdən diklənib çığırır..* C.Məmmədquluzadə. *Mühəndis təşəkkür edib pilləkənləri dikləndi.* Mir Cəlal.

**DİKLƏŞDİRMƏ** "Dikləşdirmək"dən *f.is.*

**DİKLƏŞDİRMƏK** *f.* Dik hala gətirmək.

**DİKLƏŞMƏ** "Dikləşmək"dən *f.is.*

**DİKLƏŞMƏK** *f.* Dik hala gəlmək, dik olmaq.

**DİKLƏTDİRMƏK** "Diklətmək"dən *icb.*

**DİKLƏTMƏ** "Diklətmək"dən *f.is.*

**DİKLƏTMƏK** *icb.* Dik hala saldırmaq.

**DİKLİ** *sif.* Diki, çıxıntısı olan; çıxıntılı. *Dikli daş.*

**DİKLİK** *is.* 1. Dik şeyin halı, dik vəziyyət. *Dağın dikliyi.*

2. Dik yer; təpə. *Dikliyə çatmaq.*

**DİKMƏ** "Dikmək[1]"dən *f.is.*

**DİKMƏK[1]** *f.* Əkmək, basdırmaq. Ağac dikmək. *Yaz gəlir, bağçılar bağlarda ağac dikməyə başlayacaqlar.*

**DİKMƏK[2]: gözünü (gözlərini) dikmək** – bax **göz**. **Başını aşağı dikmək** – bax **baş**.

**DİKSİNDİRMƏ** "Diksindirmək"dən *f.is.*

**DİKSİNDİRMƏK** *f.* 1. Səksəndirmək.

2. İyrəndirmək, çiyrindirmək.

**DİKSİNİŞ** *is.* Diksinmə, səksənmə.

**DİKSİNMƏ** "Diksinmək"dən *f.is.*

**DİKSİNMƏK** *f.* 1. Səksənmək. // Hövlnak yuxudan ayılmaq.

2. Hürkmək, qorxmaq, xoflanmaq.

3. İyrənmək, çiyrinmək. *Xörəkdən diksinmək. Xəstədən diksinmək.*

**DİKSİYA** [*lat.*] Sözlərin tələffüz tərzi; tələffüz. *Artistin gözəl diksiyası var. Onun diksiyası aydın deyil.*

**DİKTÁT** [*alm.*] Güclü dövlətin özündən zəif dövlətə öz şərtlərini, tələblərini zorla qəbul etdirmə siyasəti.

**DİKTÁTOR** [*lat.*] 1. Dövləti idarə etməkdə qeyri-məhdud hüquqa, ixtiyara malik olan şəxs. *Hərbi diktator.*

2. Qədim Romada: ölkə xarici və daxili təhlükə qarşısında olduğu zaman senat tərəfindən təyin edilən və qeyri-məhdud ixtiyar və səlahiyyətə malik olan şəxs.

3. *məc.* Bir işdə özünü hakimi-mütləq kimi aparan şəxs haqqında. *Özünü diktator kimi aparır.*

**DİKTATORLUQ** *is.* 1. Bir diktator kimi hakimiyyət başında durma. *Diktatorluq dövrü.*

2. Özünü diktator kimi aparma, öz iradəsini başqasına zorla qəbul etdirməyə çalışma. *Diktatorluq etmək.*

**DİKTATÚRA** [*lat.*] Hakim sinfin gücünə istinad edən qeyri-məhdud dövlət hakimiyyəti. *Hərbi diktatura.*

**DİKTƏ** [*lat.*] *köhn.* İmla. ☐ **Diktə etmək** – 1) başqasına eşitdirib yazdırmaq üçün ucadan söyləmək; 2) *məc.* zorla qəbul etdirməyə çalışmaq, əmr etmək, buyurmaq. *Şərtlərini diktə etmək.*

**DİKTOR** [*lat.*] Radio və televiziya verilişlərini mikrofon qarşısında oxuyan işçi.

**DİKTORLUQ** *is.* Diktor vəzifəsi, diktorun işi. *Diktorluq etmək.*

**DİKYARPAQ(LI)** *sif.* Yarpaqları dik duran. *Dikyarpaq(lı) ağaclar.*

**DİQQƏT** *is.* [*ər.*] 1. Fikrin, yaxud görmə və eşitmə qüvvəsinin bir obyektə tərəf yönəlməsi və onun ətrafında cəmlənməsi. *Diqqətə layiq olmaq. – Molla kitabı oxuyurdu və kəndlilər diqqət ilə qulaq asırdılar.* C.Məmmədquluzadə. ☐ **Diqqət etmək (eləmək)** – bax **diqqət vermək**. *Hər kəs istəyir ki, mənim yalanımı tutsun, təvəqqe edirəm, bu yazdığıma yaxşı diqqət eləsin.* C.Məmmədquluzadə. *İclas başlandıqda Ceyran diqqət edib görür ki, Eldar yoxdur.* S.Hüseyn.

**Diqqət kəsilmək** – tam diqqət etmək, diqqətlə baxmaq. *O bütün varlığı ilə diqqət kəsilərək qabağa baxırdı.* M.İbrahimov. *Gülsənəm arvad diqqət kəsilib öz-özündən soruşdu..* M.Hüseyn. **Diqqət mərkəzi** – diqqətin toplandığı nöqtə, hamının diqqətini cəlb edən, ən mühüm sayılan şey. *Şahnaz diqqət mərkəzində dayandığını hiss etdikcə, özünə daha çox sığal verirdi.* İ.Şıxlı. **Diqqət nəzər** – bax **diqqət** 1-ci mənada. *Danışıqda bu həyulaların diqqət nəzərini yeni bir hadisə cəlb etdi.* M.S.Ordubadi. **Diqqət oyandırmaq, diqqəti cəlb etmək (çəkmək)** – maraqlandırmaq, diqqəti özündə toplamaq. *Kəndin diqqəti cəlb edəcək cəhətlərindən birisi də bütün binaların ikimərtəbəli olması və bir quruluşda tikilməsi idi.* M.S.Ordubadi. *Hacı Rəsul adamların diqqətini çəkə bildiyinə sevindi.* Mir Cəlal. **Diqqət vermək** – fikrini bir şeyə yönəltmək, bir şey üzərində cəmləşdirmək, bir şeyə diqqətlə baxmaq, fikir vermək. **Diqqət yetirmək** – diqqət vermək. [Süleyman] *birdən Gülçöhrəni görüb diqqət yetirir.* Ü.Hacıbəyov. *Mən bu laqeyd insana diqqət verib baxırdım.* M.S.Ordubadi. *Qonum-qonşu Rübabə ilə Fatmanın danışığına diqqət yetirirdilər.* Mir Cəlal. **Diqqətini cəlb etmək** – 1) göstərmək, baxmaq, diqqət yetirmək, görməyə məcbur etmək; 2) maraqlandırmaq, diqqət yetirməsinə səbəb olmaq. *Bu hadisə mənim diqqətimi cəlb etdi.* // Əmr, xahiş mənasında (bir şeyə diqqəti cəlb etmək istədikdə deyilir). *Diqqət! İşə başlayırıq.* – [Münəccim:] *Südabəni gördün sən; Səyavuşu öpərkən? Gözdən qaçırma, diqqət!* H.Cavid.

2. Qayğı, meyil, iltifat; əhəmiyyət vermə. *İnsanların bir-birinə diqqəti. O, qonaqlara böyük diqqət və hörmət yetirdi.*

**diqqətlə** *zərf* Diqqət edərək, ciddi fikir verərək, diqqət yetirərək. [Müdir] *..bir Zeynala, bir də diqqətlə Mehribana baxdı.* S.Hüseyn. *Hamı gərgin diqqətlə susurdu.* M.İ,rahimov. // Dəqiq surətdə, təfərrüatı ilə, diqqətli surətdə, səliqə ilə, lazımi şəkildə. *İşi diqqətlə görmək. Kitabı diqqətlə oxumaq. – Məşədibəy həbsdən azad ediləsi adamların siyahısını diqqətlə nəzərdən keçirmişdi.* M.Hüseyn.

**DİQQƏTCİL** *sif.* Artıq dərəcədə diqqətli, çox diqqətli. *Diqqətcil adam.*

**DİQQƏTCİLLİK** *is.* Diqqətcil adamın xassəsi.

**DİQQƏTƏLAYİQ** *sif.* Diqqət verilməyə layiq olan; çox maraqlı. *Şəhərin diqqətəlayiq yerləri. Diqqətəlayiq hadisə.* – [N.Nərimanov "Bahadır və Sona" əsərində] *həm də diqqətəlayiq bir mütəfəkkir kimi meydana çıxmışdır.* M.Arif.

**DİQQƏTƏŞAYAN** [*ər.* diqqət və *fars.* ...şayan] Bax **diqqətəlayiq**. *Nə könül doydu, nə göz gül üzünə baxmaqdan; Öylə ki, əksi-rüxün diqqətəşayandı sənin.* Ə.Vahid.

**DİQQƏTLİ** *sif.* 1. Hər işində dəqiq və səliqəli olan, səhv və nöqsana yol verməməyə çalışan, diqqət, səy və qeyrət göstərən. *Diqqətli adam. Diqqətli şagird. Diqqətli müşahidəçi. Diqqətli usta. – Sarxan .. çox diqqətli* (z.) *və olduqca sayıq davranırdı.* M.Hüseyn. *O, qızının sağalmasını həkimin diqqətli müalicəsində görürdü.* Ə.Abasov.

2. Diqqətlə görülmüş; yaxşı, səliqəli. *Diqqətli iş. Diqqətli yazı.*

3. Qayğı ilə yanaşan; həssas. *O öz yoldaşlarına qarşı çox həssas və diqqətlidir.*

4. Ehtiyatlı. *Dənizdə çimərkən diqqətli* (z.) *olmalı!*

**DİQQƏTLİLİK** *is.* 1. Diqqət göstərmə, diqqətli olma; diqqət.

2. Ehtiyatlılıq.

**DİQQƏTSİZ** *sif.* 1. Diqqətini, fikrini cəmləşdirə bilməyən; huşsuz. *Diqqətsiz şagird. Diqqətsiz adam.*

2. İşinə diqqətlə baxmayan, işinin yaxşı və səliqəli olmasına fikir verməyən, işi başdansovma görən; başısoyuq. *Diqqətsiz usta.*

3. Səliqəsiz, başdansovma, diqqətsiz görülmüş. *Diqqətsiz iş.*

4. Ehtiyatsız. *Diqqətsiz hərəkət.*

**DİQQƏTSİZCƏSİNƏ** *zərf* Diqqətsizliklə, başısoyuqluqla.

**DİQQƏTSİZLİK** *is.* 1. Diqqətsiz adamın hal və keyfiyyəti. *Onun diqqətsizliyinə adam təəccüb qalır.*

2. İşə diqqət göstərməmə, başısoyuq yanaşma; başısoyuqluq. *Diqqətsizlik göstərmək. Diqqətsizlik nəticəsində. Diqqətsizlikdən doğan nöqsanlar. – Avariyalar çox vaxt*

*onların diqqətsizliyi və təcrübəsizliyi üzündən olur.* M.Hüseyn.

**DİL**[1] *is.* 1. *anat*. İnsan və onurğalı heyvanların ağız boşluğunda olub, qidanın çeynənilib udulmasına kömək edən və onun dadını bildirən, insanda isə, əlavə olaraq, danışıq səslərinin əmələ gəlməsində iştirak edən orqan. *Dillə dadmaq. Dili ilə yalamaq. Dilini çıxartmaq.* – [Mahirə] *qurumuş dodaqlarını dili ilə islatdı.* M.Hüseyn. // Heyvan dilindən hazırlanmış yemək. *Bişmiş dil.*

2. İnsanlar arasında ünsiyyət vasitəsi olub, onların bir-birlərini başa düşmələrinə və bir-birləri ilə fikir mübadiləsi etmələrinə imkan verən səs, söz və qrammatik vasitələr sistemi. *Azərbaycan dili. Rus dili. Dünya dilləri. Qədim dillər. Bir neçə dil bilmək. – Elə ki sabah oldu, Sona fars dilini oxumağa başladı.* N.Nərimanov. // *dan*. Ləhcə, şivə mənasında. *Bu, lap gəncəli dilində danışır.*

3. Bu və ya digər səciyyəvi xüsusiyyətə malik olan danışma və ya ifadə tərzi; üslub. *Ədəbi dil. Yazıçının dili. Qəzet dili. Sabirin dili. Məqalə sadə dildə yazılmışdır.*

4. Danışmaq qabiliyyəti, nitq. *Qoy özü danışsın, özünün dili var. – Dili olmasa, gözünü qarğalar didər.* (Məsəl).

5. Danışma, danışma tərzi. *Onun çox acı dili var. Şirin dillə danışmaq. Kinayəli dil. – Dil var bal gətirər, dil var bəla.* (Ata. sözü). *Xoş dil ilanı yuvasından çıxarar.* (Məsəl). *Məhəmmədhəsən əmi şirin dillə nə qədər oğluna təskinlik verdisə, oğlu bir tikə ovunmaq bilmədi.* C.Məmmədquluzadə.

6. *məc.* Bir şeyi ifadə və ya izah edən, ünsiyyət vasitəsi ola bilən şey (səs və s.) haqqında. *Musiqi dili. Quşların dili. Rəqəmlərin dili.*

7. Müxtəlif alətlərin, cihazların və s.-nin uzanan və əksərən oynar, mütəhərrik hissəsi. *Zəngin dili. Toqqanın dili.* // Qıfılı açmaq və bağlamaq üçün xüsusi formalı metal alət; açar. // Musiqi alətlərində (pianoda, qarmonda və s.-də) səs çıxarmaq üçün üstündən barmaqla basılan lövhəcik. *Royalın dili. Qarmonun dilləri.*

8. *coğr.* Dənizin, içəriyə doğru uzanmış uzun, üstü düz, alçaq qumlu quru hissəsi. *Dənizdə beş kilometr uzunluğunda süni dil yaradılmış, küləkdən yaxşı qorunan buxta əmələ gəlmişdir.*

9. *məc*. Müharibədə düşmənin vəziyyəti haqqında məlumat alına biləcək əsir. *Dil almaq* (*tutmaq*). *Dil dalınca getmək.*

◊ **Ağzı var, dili yox,** yaxud **ağzında dili yox** – sakit, fağır, səsi çıxmayan adam haqqında. **Al dil** – b a x **al**[2]. **Alovun dili** – yuxarı qalxan alov haqqında; zəbanə. **Dil açmaq** – 1) dinmək, danışmağa başlamaq, dərdini söyləmək. *İki dil açdı ki, vəsf eyləsin o gülbədəni; Fəzilətü hünərin etdi aşkar qələmi.* S.Ə.Şirvani. *Ancaq qız da dil açıb bir kəlmə demir, bir xahiş də etmirdi.* Mir Cəlal. // Körpə uşaqlar haqqında: tək-tək sözləri deməyə başlamaq, təzə-təzə danışmağa başlamaq. *Uşaq hələ dil açmayıbdır. – Balam dil açan günü; Mat qaldı ana bülbül.* (Layla); 2) yalvarmaq, xahiş etmək. **Dil ağıza qoymamaq** – b a x **dil boğaza qoymamaq**. [Əminə] *şıltaq uşaqlar kimi atılıb-düşür, dil ağıza qoymurdu.* S.Rəhimov. **Dil ağıza salmamaq** – b a x **dil ağıza qoymamaq**. *Gecə səhərəcən dil ağıza salmaz; Qonşuya un verib borcunu almaz.* Aşıq Əziz. **Dil bəlası** – öz dilinin bəlasını çəkmə, dediyi sözün pis nəticəsini görmə. **Dil boğaza qoymamaq** – çox danışmaq, arasıkəsilmədən danışmaq. **Dil bulamaq** – bir işdə sözlə iştirak etmək, birinə kömək məqsədi ilə başqasına söz söyləmək, xahiş etmək, vasitəçi olmaq. *Elə dedim, a qardaş, o gədənin işinə bir dil bulayasan.* S.Rəhimov. **Dil çıxarmaq** – 1) istehza etmək, sataşmaq, ələ salmaq; 2) yalvarmaq (çox vaxt "dil çıxarıb yalvarmaq" şəklində işlənir). **Dil deyib ağlamaq** – bayatı çağırmaq, deyib oxşamaq. [Vidadi:] *O ölsə, dağlar da dil deyib ağlar; Əfv edin, yaxşılıq qalar yadigar.* S.Vurğun. *Analar övladına, bacılar qardaşına; Həsrət qalıb, yas tutub, dil deyib ağlar yenə.* M.Rahim. **Dil göstərmək** – birini acıqlandırmaq, sataşmaq, istehza etmək məqsədi ilə dilin çıxarıb ona göstərmək. **Dil olmaq** – 1) danışmaq. *Simurq dil olub, Simanı başa salıb, mindirib dalına, aparıb qoydu nar bağına.* (Nağıl); 2) yalvarmaq. **Dil öyrətmək** – b a x **dil vermək** 2-ci mənada. *Saç qara kömürdəndi; Gün keçər, ömürdəndi; Sənə dil öy-*

*rədənin; Ürəyi dəmirdəndi.* (Bayatı). **Dil pəhləvanı (ustası)** – danışmaqda mahir olub, əlindən iş gəlməyən adam haqqında. **Dil tapmaq** – qarşılıqlı anlaşmaq, razılıq əldə etmək; yola gətirmək, razı etmək üçün yol tapmaq. *Bax, o gedən qızla heç dil tapa bilməyirəm.* M.Rahim. **Dil tərpətmək** – 1) söz söyləmək, danışmaq. *Kim padşahın pisliyinə bir dil tərpətsə, o saat tutub qazamata salırdılar.* M.Hüseyn; 2) başqası üçün birindən bir şey xahiş etmək. **Dil tökmək** – 1) şirin sözlərlə yola getməyə, razı salmağa, yaxud başını tovlamağa çalışmaq. *Səlim bəy bu sözü eşidən kimi ürəklənib başladı Nəbiyə dil tökməyə, yalvarmağa.* "Qaçaq Nəbi". *Yox, qonşu, dil tökmə, keçəl suya gedən deyil...* C.Cabbarlı. // Çox xahiş etmək, yalvarmaq. *O mənə bir dil tökdü, bir dil tökdü, başınıza dönüm, qaldım mat-məəttəl.* N.Vəzirov. [Məsmə ərinə] *nə qədər dil tökür, qandırmaq istəyirsə də, faydası olmayır.* S.Hüseyn. *Sənə öz qəlbimi açdım, sənə min dil tökdüm; Eşqimə gülləri, bülbülləri şahid çəkdim.* S.Rüstəm; 2) b a x **dil deyib ağlamaq**. *Məryəm yalqızlıqdan istifadə edərək, acı-acı dil töküb ağlamağa başladı.* A.Şaiq. **Dil tutulması** – danışmaq qabiliyyətini itirmə. **Dil uzatmaq** – 1) münasibətsiz, nalayiq söz söyləmək; danışıqda həddini aşmaq; 2) tənə vurmaq, danlamaq. *Odlara tutuşdu, yasə batdı; Ol qönçədəhanə dil uzatdı.* Füzuli. **Dil vermək** – 1) söz vermək, vəd etmək; 2) öyrətmək, danışmağa, iddiaya cürətləndirmək (bu mənada çox vaxt "ağzına dil vermək" şəklində işlənir). *Hacı Murad ağıl öyrətməkdən, ağzına dil verir.* S.S.Axundov. *Qaranın .. yanda durub oğluna dil verməsi də ona ikinci bir dərd olmuşdu.* M.Hüseyn. **Dil verməmək** – başqalarına danışmağa imkan verməmək, danışmağa qoymamaq, mane olmaq. *Danışana dil vermir, yeriyənə yol.* (Ata. sözü). **Dil vurmaq** – ələ almaq, dilə tutmaq, xoş dillə öz tərəfinə çəkməyə çalışmaq, öyrətmək. **Dil yarası** – acı tənə, acı söz nəticəsində doğan inciklik hissi, ağır təhqir. *Qılınc yarası saralar, dil yarası sağalmaz.* (Ata. sözü). **Dil yetirmək** – 1) başqası üçün birindən bir şey xahiş etmək, birinə xahişlə müraciət etmək; 2) üzüzə danışa bilmək, qarşı-qarşıya durub danışmaq. *Oturaydım göz-gözə; Yetirəydim dil yara.* (Bayatı); 3) danışmaqda, mübahisədə ayaqlaşa bilmək. *..Sən* [rus müəllimləri ilə] *çox durub-oturmusan, sənə dil yetirmək olmaz.* Ə.Nəzmi. **Dildə tük bitmək** – bir şeyi həddən artıq təkrar etməkdən, söyləməkdən, yada salmaqdan usanmaq. *Deyə-deyə dilimizdə tük bitdi.* **Dildən demək (danışmaq)** – ciddi, ürəkdən söyləməmək, qeyri-səmimi demək. [Kərim] *Hüseynağanın nəyi ürəkdən, nəyi dildən dediyini ayırd edə bilmirdi.* M.İbrahimov. **Dildən düşmək** – bərk yorulmaq, üzülmək, əldən düşmək, usanmaq. *O qədər yalvardım ki; Axır düşdüm mən dildən.* (Bayatı). *Sənin o sövdalı solğun baxışın; Xatırladır mənə bir pərizadı; Ki, düşməz ölüncə dilimdən adı.* Ə.Cavad. *İstədi səslənsin ki, "ay xala, yorulub dildən düşərsən, gözlə qayıtsın".* Mir Cəlal. **Dildən (dillərdən) düşməmək** – yaddan çıxmamaq, məşhur olmaq, unudulmamaq, daim söylənmək. *Onun adı dillərdən düşmürdü.* **Dildən salmaq** – əldən salmaq, yormaq, üzmək, taqətdən salmaq, usandırmaq. *Götürmüş ağzına boran hər yanı; Aclıq, soyuq salıb dildən insanı.* M.Rahim. **Dil-dil ötmək** *şair.* – cəh-cəh etmək, çox gözəl oxumaq, tərənnümə gəlmək. *Yaz mövsümü bülbül dil-dil ötəndə; Bağ-bağçalar nərgizlənir, güllənir.* Qurbani. // *məc.* Təşbehlərdə. *Yenə o bağ olaydı, yenə o qumlu sahil; Sular ötəydi dil-dil.* M.Müşfiq. **Dilə basmaq** – gurultulu sözlərlə birini fikrindən yayındırmağa çalışmaq. *Möhlətov öz hərəkətinin yersiz olduğunu duyub müdiri dilə basdı.* Mir Cəlal. **Dilə düşmək** – b a x **dildən-dilə düşmək** (**"dildən-dilə"**də). **Dilə düyün düşmək** – b a x **dildə tük bitmək**. **Dilə gəlmək** – danışmağa başlamaq, dillənmək, sükutu pozaraq danışmaq. *Fəhlələr dilə gəliblər ki, ay ağa, bizim çörək pulumuzu alırsan, biz ki acından ölməyəcəyik.* "Mol. Nəsr.". // *məc.* Şairanə təşbehlərdə. *Əvvəl cansız ikən, sonra önündə; Quşlar gəlmiş dilə, gülmüş çiçəklər.* Ə.Cavad. *Üfüqdə başlanan işıq getdikcə genişlənirdi. Dərədə quşlar oyanırdı. Meşə dilə gəlirdi.* S.Rəhimov. *..Melodiyanın ilk sədaları təzəcə dilə gəlmişdi.*

Ə.Məmmədxanlı. **Dilə gətirmək** – bərk təsir edərək danışdırmaq, dilləndirmək. *Dilsizi dilə gətirir; Əsli, qaşların, gözlərin!* Aşıq Kərəm. **Dilə gətirməmək** – söyləməyi nalayiq, qeyri-münasib hesab etmək. **Dilə (dillərə) salmaq** – söhbət, danışmaq üçün mövzu etmək, söz-söhbət hədəfi etmək. *Altunam, alma məni; Dillərə salma məni; Apar sərrafa göstər; Qəlpəmsə, alma məni.* (Bayatı). **Dilə tutmaq** – şirin sözlərlə birini razı salmağa, yola gətirməyə, bir şeyi əldə etməyə çalışmaq. *Faytonçunu bu dəfə dilə tutduq və haqqının üstünə genə beş şahı, üç şahı qoymaq ilə razı elədik ki, iki gün də gözləsin.* C.Məmmədquluzadə. *Hacı Soltan Həsənağanı .. dilə tutub onu ticarət məqsədi ilə İrana göndərəcəyini vəd edirdi.* S.Hüseyn. **Dilə-sözə tutmaq** – b a x **dilə tutmaq**. *Nə qədər mollanı dilə-sözə tuturlar ki, quzunu kəsib onları qonaq eləsin, bir şey çıxmır.* "M.N.lətif.". **Dili açılmaq** – 1) danışmağa başlamaq, uzun sükutdan sonra dinmək. *Rəşidin dili açıldı, o, ürəyindəkiləri ortalığa boşaltmağa başladı.* M.S.Ordubadi; 2) danışıq qabiliyyətini itirmiş adamın nitqi açılmaq. **Dili ağzına sığmamaq** – öyünmək, öz-özünü çox tərifləmək. [Kərim baba:] *Arvad nədir ki, onun igidliyi nə olsun? Hay-hay! Beş-on qoyun sağmış, nehrə çalxamış, yağ, pendir tutmuş, dili ağzına sığmır.* A.Şaiq. **Dili batmaq** – b a x **dili tutulmaq**. *Bu vaxt küçədə səs qopdu; gördüm, darvazadan müsəlmanı çıxartdılar, biçarənin dili batmışdı.* Çəmənzəminli. **Dili büdrəmək** – danışarkən çaşmaq, yanılmaq, səhv danışmaq, bir söz əvəzinə başqa söz demək. **Dili dolaşmaq** – b a x **dili topuq çalmaq**. *Əsəbilikdən işdə bəzi çaşır; Əlləri titrəyir, dili dolaşır.* A.Səhhət. *Huş başımdan çıxdı, dilim dolaşdı; Gözlərim sataşdı, buxağa düşdü.* Aşıq Ələsgər. **Dili dönməmək** – 1) b a x **dili batmaq**; 2) deyilməsini caiz bilməmək, deməyə qıymamaq, dilinə gətirə bilməmək. *Mən Zakirəm, dilim dönməz hər ada; Göz yaşım tək ola bilməz bir ada.* Q.Zakir. [Gəldiyevin] *boğazı tikilmiş kimi səsi çıxmadı, dili dönmədi.* Mir Cəlal. **Dili gəlməmək** – 1) deyə bilməmək, tələffüz edə bilməmək, danışa bilməmək, danışmaq iqtidarında olmamaq. *İmran kişi necə qəzəblənmişdisə, söz deməyə dili gəlmirdi.* M.Hüseyn; 2) b a x **dili dönməmək**. *Güman ki, Şirinxanımın indi qızına bir çox şeylər deməyə dili gəlmirdi.* Mir Cəlal. **Dili gicişmək** – bir şey demək istəmək. **Dili gödək olmaq** – b a x **dili qısa olmaq**. *Vəzirbəylinin yanında Gəldiyevin dili gödək idi.* Mir Cəlal. **Dili ilanı yuvadan çıxardar** – dil tökməkdə çox mahir adam haqqında. *Atalar deyiblər ki, tacir-tüccar dili ilanı yuvasından çıxardar.* "Koroğlu". **Dili qısa olmaq** – birinin yanında qüsuru, yaxud sirri olduğu üçün danışmağa, söz söyləməyə, ya da etiraz etməyə haqqı və cəsarəti olmamaq. **Dili qısalmaq** – təqsirini, qüsurunu bilib danışmağa cəsarət etməmək, danışmaqdan utanmaq. *Dəmirovun getdikcə artan hörməti və nüfuzu müqabilində* [Rüxsarənin] *düşmənlərinin dilləri qısalırdı.* S.Rəhimov. **Dili qurumaq** – 1) danışmaq qabiliyyətini itirmək; nitqi qurumaq. *Ağlayır, çıxmayır sədası fəqət; Çünki qəmdən onun dili qurumuş.* C.Cabbarlı; 2) qarğış, bəddua mənasında – **"dilin (dilim) qurusun!"** şəklində. *Mən sənə yar desəm, dilim qurusun! Yarı, məhəbbəti sən atmadınmı?* S.Vurğun. **Dili söz tutmamaq** – bu və ya başqa səbəbə görə danışa bilməmək, danışmaq qabiliyyətini itirmək. *Bahadırın əvəzinə Pəri nənə cavab vermək istədi, amma hirsindən dili söz tutmadı.* M.Hüseyn. *Hirsdən Narıncın dili söz tutmurdu.* S.Rəhman. **Dili topuq vurmaq (çalmaq)** – b a x **dili büdrəmək**. *..Daxilən daha narahat olan Leyləyin dili topuq vururdu.* S.Rəhimov. **Dili tutmamaq** – b a x **dili tutulmaq**. **Dili tutulmaq** – danışmaq qabiliyyətini itirmək, danışmağa qüdrəti çatmamaq. *Xoş ol zaman ki, ol şəh ilə həmzəban olam; Hər sözdə bir dilim tutulub natəvan olam.* S.Ə.Şirvani. *Sənətim məsiyət, yoxdur savabı; Sual üçün dilim tutmur cavabı.* Aşıq Ələsgər. [Tahirin] *elə bil qızdırmadan dili tutulmuşdu.* M.Hüseyn. **Dili uzun olmaq** – 1) hər hansı bir cəhətdən öz üstünlüyünü dərk edərək haqlı adam kimi cəsarətlə danışmaq. *Dövlətlinin dili uzun olar, ağlı qısa.* (Ata. sözü); 2) iftixar etmək, qürrələnmək. *..Bu gün* [Aydının] *dili uzun idi,*

*yoldaşı Seryojanı məğlub edib öz üstünlüyünü göstərmək istəyirdi.* M.Rzaquluzadə. **Dilimin ucundadır** – bir sözü və ya adı tam xatırlayıb yada sala bilməyəndə söylənən ifadə. *Adı dilimin ucundadır*. **Dilin yansın** – b a x **dilin qurusun** (**"dili qurumaq"** 2-ci mənada). **Dilində (dilinə) tük (ot) bitmək** – b a x **dildə tük bitmək**. **Dilindən daş asılmaq** – susmaq, dinməmək, danışmamaq, ağzını açmamaq. [Xosrov:] *Bu düzdür, görürəm, yumşaldıqca mən; Bir daş asılır onun dilindən.* S.Vurğun. **Dilindən düşməmək** – daim təkrar etmək. [Südabə:] *Neçin qovğa sözü düşməz dilindən? Cəlladmısan, səndə könül yoxmudur?* H.Cavid. [Buğacın] *..“atacan, xan baba!” – sözləri dilindən düşməzdi.* M.Rzaquluzadə. **Dilindən qaçırmaq** – b a x **ağzından qaçırmaq** (**"ağız[1]"**da). **Dilindən qıfıl götürülmək** – b a x **dili açılmaq** 1-ci mənada. *Bununla da, bir haya bənd imişlər kimi, bayaqdan susmaqda olanların dilindən qıfıl götürüldü.* Ə.Əbülhəsən. **Dilinə düyün düşmək** – b a x **dildə tük bitmək**. **Dilinə gətirmək** – 1) danışmaq, söyləmək. *Bundan sonra görüm kim cürət edib dilinə gətirə biləcək ki, belə iş yoxdur, bu əhvalatı dərviş öz sinəsindən icad edib.* N.Vəzirov. [Rüstəm:] *Heç bir qiymət.. dilimə gətirmədim.* S.Rəhimov; 2) söyləməyi münasib bilmək. *Bu kimi ifadəni dilinə gətirmə. – Soruşanda təsərrüfat müdiri and-aman elədi: – Nə Ağarzanı tanıyıram, nə də buradakı söhbəti dilimə gətirmişəm.* Mir Cəlal. **Dilinə qıfıl vurmaq** – dinməyə, danışmağa, ağzını açmağa qoymamaq; susdurmaq. *Dönüm mən Osmanın igid əlinə; Yaxşı qıfıl vurdu bunun dilinə.* H.K.Sanılı. **Dilinə qıfıl vurulmaq** – b a x **dilindən daş asılmaq**. **Dilinə pay çıxmaq** – b a x **dilinə düyün düşmək**. **...dilinə salmaq** – söz-söhbət, dedi-qodu və ya şayiə üçün mövzu etmək. *Məsmə arvadın başında fikirlər bir-birini təqib edirdi: ..Nə olacaq, nə olacaq?.. Qızı kim saldı bunların dilinə?* Mir Cəlal. **Dilinə vurmaq** – dadmaq, dadmaq üçün yoxlamaq. *Dilimə vurdum, gördüm acıdır.* **Dilinə vurmamaq (dəyməmək)** – heç yeməmək, içməmək, dadmamaq, dadını bilməmək. *Otuz-qırx il bundan irəli bir müsəlman ki bir rus məclisinə düşərdi, öldürsəydin də, bir qətrə içki dilinə vurmazdı.* C.Məmmədquluzadə. [Mozalan bəy:] *Xeyr, heç anadan olandan dilimə dəyməyib.* Ə.Haqverdiyev. **Dilini açmaq** – çoxdan danışmayan adamın nitq qabiliyyətini bərpa etmək, qaytarmaq. **Dilini ağzında saxlamaq** – b a x **dilini saxlamaq**. **Dilini bağlamaq** – 1) susdurmaq, danışmağa qoymamaq, susmağa məcbur etmək; 2) dua, ovsun və s. vasitəsilə zərərli bir təsirin qabağını almaq. **Dilini bilmək (öyrənmək)** – 1) baş açmaq, sirrindən xəbərdar olmaq. *Lalın dilini nənəsi bilər.* (Ata. sözü). *Aşığam, yar dilini; Biganələr nə bilər; Yar bilər yar dilini.* Sarı Aşıq. *Bu yerlərdə hər şey mənə tanışdır; öyrənmişəm təbiətin dilini.* S.Rüstəm; 2) yolunu bilmək, üsulunu bilmək, həllini bilmək. **Dilini boğazından çıxarmaq** – 1) çox zülm edərək öldürmək; 2) bərk cəzalandırmaq. **Dilini dişləmək** – 1) sözü yarıda kəsmək, sözün dalını gətirməmək; 2) yadından çıxmış bir şey birdən yadına düşmək, xatirinə gəlmək. **Dilini kəsmək** – 1) susmağa, dinməməyə məcbur etmək; susdurmaq, kiritmək; 2) susmaq, dinləmək, danışmamaq. [Molla:] *Dilini kəs, .. mənim ağzımı çox açdırma, yoxsa törətdiyin cəmi işləri ortalığa qoyaram.* Çəmənzəminli. *Bəs nə üçün dinməyir, indi kəsibdir dilin?* Ə.Nəzmi. **Dilini könlü ilə bir eləmək** – səmimi olmaq, sözü ilə işi bir olmaq. *Sadiq oldur dilini könlü ilə bir eləyə.* Nəsimi. **Dilini qarnına qoymaq** – susmaq, danışmamaq. **Dilini saxlamaq** – bir şeyi deməkdən saqınmaq, danışmamaq, susmaq. **Dilini tapmaq (tutmaq)** – b a x **dil tapmaq**. **Dilinin ucuna gəlmək** – söyləmək istərkən söyləyə bilməmək, yaxud söyləməmək. **Dilinin üstündə dil bitmək** – həddindən artıq danışqan, naqqal adam haqqında. **Dillər əzbəri,** yaxud **dillərdə əzbər (dastan) olmaq** – çox məşhur olmaq, haqqında ağızlarda danışılmaq. *Nəbinin igidliyi, əliaçıqlığı dillərdə dastan olur.* "Qaçaq Nəbi". *Elə sən gözəlsən binadan bəri; Sözlərin olmuşdur dillər əzbəri.* S.Vurğun. **Dillərdə gəzmək (dolaşmaq)** – 1) b a x **dillərə düşmək**; 2) camaat arasında danışılmaq, şayiə yayılmaq. *Bu günlər .. Məhəmmədhəsən Mirzənin Təbrizə gəlməsi məsələsi yenə də dillərdə gəzirdi.*

M.S.Ordubadi. **Dillərdə söylənmək** – b a x **dillərə düşmək**. ..*"Filankəsi barmaqnan göstərirlər", yəni gör nə qədər şöhrətlənib ki, hər yanda adı dillərdə söylənir.* C.Məmmədquluzadə. **Dillərə düşmək** – məşhur olmaq, yayılmaq, haqqında hamı tərəfindən danışılmaq. *Balının tərifi düşüb dillərə; Unutmaz dadını yeyən bir kərə.* R.Rza. *Doğrudur, .. "Ovçu Pirim" haqqında əcaib yalanlar dillərə düşmüşdür.* M.Rzaquluzadə. **Nə dil bilsin, nə dodaq** – tamamilə gizli saxlanmalı söhbət, sirr haqqında. **Ölü dil** *dilç.* – indiki dövrdə işlənilməyən, ancaq yazılı abidələrdə qalan dil. *Latın dili ölü dildir.* **Sümüksüz dil** – ağzına gələni danışan adam haqqında. **Ümumi dil** – qarşılıqlı razılıq, anlaşma. *Ümumi dil tapmaq.*

**DİL**[2] *is.* [*fars.*] *klas.* Ürək, könül, qəlb. *Müjdə, ey dil, ki səni görməyə canan gəldi.* Ə.Nəbati. *Ey dil, baxırmısan gölü dərya bilənlərə.* C.Cabbarlı.

◊ **Dil bağlamaq** – könül bağlamaq, ürəkdən sevmək, bənd olmaq. **Dil vermək** – b a x **dil bağlamaq**. *Eşqə dil verdim, bəladən başqa bir şey görmədim.* H.Cavid. **Ey dili-qafil** – təəccüb, peşmançılıq, təəssüf bildirir. [Yəhya Kamal:] *Ey dili-qafil, o nə idi mən yazdım!* Mir Cəlal.

**DİL-AĞIZ** *is.* Üzrxahlıq mahiyyətində olan sözlər. □ **Dil-ağız etmək (eləmək)** – üzrxahlıq mahiyyətində xoş sözlər söyləmək, yaxud xoş sözlər söyləyərək mehribanlıq göstərmək. *Bəy gəlinə dil-ağız etdikdən sonra, onun üzünü görmək istərdi.* H.Sarabski. *Məmməd xan dil-ağız edib tələsməmələrini dedisə də, lakin qonaqlar az sonra durub getdilər.* P.Makulu.

◊ **Dil-ağıza salmaq** – 1) hamıya yaymaq, bildirmək; 2) pisinə danışmaq. **Dildə-ağızda gəzmək** – b a x **dilə-ağıza düşmək**. *Xalçasının şöhrəti; Gəzir dildə-ağızda.* M.Seyidzadə. **Dildən-ağızdan düşmək (olmaq)** – b a x **dildən düşmək** ("**dil**[1]"də). **Dilə-ağıza düşmək** – 1) yayılmaq, şöhrətlənmək, dillər əzbəri olmaq. *Düşdü şeirlərin dilə-ağıza; Şimşəktək zülmətin qoynundan çaxdın.* S.Rüstəm; 2) pisinə danışılmaq, pis cəhətdən məşhur olmaq. **Dili(n)-ağzı(n) qurusun!** – b a x **dili qurumaq** 2-ci mənada (**"dil**[1]**"**də). [Arvad:] *Əstəğfürullah, əstəğfürullah, qələt elədim, dilim-ağzım qurusun!* Ə.Haqverdiyev. *Dilim-ağzım qurusun; Gördüm bir qara qarğa; Qəflətdən bir tərəfdən; Atıldı ortalığa.* R.Rza. **Dili-ağzı qurumaq** – b a x **dili qurumaq** (**"dil**[1]**"**də). *Bəs indi niyə dilin-ağzın quruyub?* M.Rzaquluzadə. **Dili-ağzı tutulmaq** – nitqi tutulmaq, danışa bilməmək. [Sədr:] *Ay hay, mən də deyirəm, yəqin sevincindən dili-ağzı tutulub.* M.Rzaquluzadə. **Dilini-ağzını bağlamaq** – b a x **dilini bağlamaq** (**"dil**[1]**"**də). *İstədim bir söz deyəm; Dilim-ağzım bağladı.* (Bayatı).

**DİLALTI** *sif. anat.* Dilin altında olan. *Dilaltı sinir.*

**DİLARA** *sif.* [*fars.*] *şair.* Ürəkaçan, könülaçan, dilbər; sevgili (klassik şeirdə gözəlin epitetlərindən biri). *Dəhanı gülşəkər, zülfü dilara.* Ə.Nəbati. *Leyk hanı səndə bəsirət gözü; Ta görəsən vəchi-dilarasını?* M.Ə.Sabir. *Rüxsari-dilarasına bax, şeir elə inşad; Qoy xəlq oxusun, söyləsin, əhsən sənə, ustad!* C.Cabbarlı.

**DİLARAM** [*fars.*] b a x **dilara**. *Taki sən getdin yanımdan, ey dilaramım mənim; Haləti-vəslin könüldə pasiban qıldı mənə.* Xətayi. [Ziba xanım:] *Ax, hardadır bu dilaram çəngi?* M.F.Axundzadə. *İndi bir başqa dilarama pərəstişkaram.* A.Səhhət.

**DİLARXASI** *sif. dilç.* Dilin arxa hissəsi ilə arxa damağın bir-birinə yaxınlaşması nəticəsində əmələ gələn. *Dilimizdəki q, ğ, k, x səsləri dilarxası səslərdir.*

**DİLAVƏR** *sif.* [*fars.*] 1. Qoçaq, igid, cəsur, ürəkli, mərd. *Çətin ələ düşər dilavər gözəl.* Q.Zakir. *Zeynəb .. dilavər, kimsədən qorxmaz və çəkinməz bir qarı idi.* S.S.Axundov. *Fərman həmişə belə qoçaq və dilavər qızların yanında sıxılar və özünü itirərdi.* Ə.Sadıq. // İs. mənasında. *Dilavərlər yığıldılar.*

2. Dilli, yaxşı danışmağı bacaran, məharətlə danışa bilən. *O, çox dilavər adamdır.* – [Gövhər qarı:] *Gərək ortada mənim kimi dilavər bir adam ola ki, tükü-tükdən seçə bilə.* İ.Şıxlı. *Dedim: – Söz ustası, mahir, dilavər; Şairə Məhsəti sənmisən məgər?* M.Dilbazi.

**DİLAVƏRANƏ** [*fars.*] b a x **dilavərcəsinə**.

**DİLAVƏRCƏSİNƏ** *zərf* Qəhrəmancasına, qoçaqcasına, mərdcəsinə. *Dilavərcəsinə hərəkət.*

**DİLAVƏRLƏNMƏ** "Dilavərlənmək"dən *f.is.*

**DİLAVƏRLƏNMƏK** *f.* Dilavər olmaq, cəsarətlə danışmaq.

**DİLAVƏRLƏŞMƏK** *f.* Daha cəsarətli olmaq, ürəklənmək, qoçaqlaşmaq.

**DİLAVƏRLİK** *is.* 1. İgidlik, cəsarət, qoçaqlıq, mərdlik. *Dilavərlik göstərmək.*

2. Dillilik, gözəl danışmaq qabiliyyəti, danışmaqda mahirlik. *Güləsər atasının və anasının vəziyyətini başa düşdü, özü də hiss etmədən dilavərliyə başladı..* İ.Şıxlı.

**DİLAVİZ** *sif.* [*fars.*] *klas.* Ürəyi cəlb edən, ürəyə yapışan, ruhu oxşayan, xoşagələn. *Buxağı bərgi-gül, zülfü dilaviz; Dəhanı mirvarid xəzinəsidir.* Ə.Nəbati. *Nə qədər şairin təbi səlim, zehini açıq .. olsa, bir o qədər onun qələmi*(*ndən*) *vücuda gələn nəqşlər və təsvirlər* [gözəl] *və dilaviz olacaqdır.* F.Köçərli. *Xəfif bir külək arabir dilaviz rayihəsi ilə insanın ürəyini oxşayırdı.* C.Cabbarlı.

**DİLAYRI** *sif.* Ayrı dildə danışan, ayrı millətdən olan. *Mən onu dinləyirəm böyük iş meydanında; O yerdə ki arzusu böyük həqiqət olur; Dilayrı bacının da, dilayrı qardaşın da.* R.Rza.

**DİLAZAR** *sif.* [*fars.*] İnsafsız, rəhmsiz, şəfqətsiz, mərhəmətsiz, könülincidən, könülə cəfa verən (klassik şeirdə adətən gözəlin epitetlərindən biri). *..Qorxuram, cismü can saralıb yana; Ta yetirəm dilazara dərdimi.* Q.Zakir. *Dil verməz idim mən sənə, ey yari-dilazar; Bilsəydim əgər böylə dilazar olacaqsan.* S.Ə.Şirvani.

**DİLAZARLIQ** *is.* İnsafsızlıq, rəhmsizlik, şəfqətsizlik, mərhəmətsizlik.

**DİLBAŞ** *is. bayt.* Xüsusilə qaramalda baş verən xəstəlik. *Mal dilbaş olub.*

**DİLBAZ** *sif.* [*fars.*] *klas.* Ürəkaçan, dilbər, dilara.

**DİLBƏDİL** *zərf klas.* Dil-dilə, səmimiyyətlə, sədaqətlə. *Tutmuş idim səri-kuyində mənzil; Gecə-gündüz danışırdım dilbədil.* Q.Zakir. *Nola, Vahid, yarə zülfündən çəkən möhnətləri; Dil açaydın, şanətək şərh eyləsəydim dilbədil.* Ə.Vahid.

**DİLBƏR** *sif.* [*fars.*] *şair.* Gözəl, sevgili, canan. *Dilbər qız. Dilbər gəlin. – Zeynal özünü yalnız dilbər bir qadının ağuşunda əyləndirə biləcəyini iddia edirdi.* S.Hüseyn. // İs. mənasında. *Qiblənüma məhəbbəti dilbərin; Meyli bizdən qeyri yana dönübdü.* Aşıq Ələsgər. *..Meşənin çıxacağında təzə tülu etmiş gün uyqudan oyanmış dilbər kimi üzümə güldü.* A.Divanbəyoğlu. *Alagözlü Girdman dilbəri buz kimi soyuq çeşmədən su gətirib yaralı cəngavərə verdi.* M.Hüseyn. // Şairanə təşbehlərdə. [Cəmil bəy:] *Ormanları inlədən musiqi, ruhumuzu güldürən bülbül nəğmələri nə qədər munis, nə qədər dilbər!* H.Cavid.

**DİLBƏRANƏ** [*fars.*] *şair.* b a x **dilbərcəsinə**. *Ey dilbəranə tərzdə cövlan edən çocuq.* M.Ə.Sabir.

**DİLBƏRCƏSİNƏ** *zərf* Dilbər kimi, dilbər ədası ilə.

**DİLBƏRLİK** *is.* Gözəllik, canalıcılıq.

**DİLBƏSTƏ** *sif.* [*fars.*] *klas.* Könlü bağlı, ürəyi bağlı; aşıq, vurğun.

**DİLBİLƏN** *sif.* və *is.* Düşüncəli, yolbilən, təcrübəli. *Bahardır, nə bilir zövqü hər naşı; Çağır dilbiləni, yarı, yoldaşı.* M.Rahim. *Kəndin ağsaqqalları, dilbilənləri bir yerə toplaşdılar.* Ə.Vəliyev. // Tez başa düşən, mətləb anlayan. *Dilbilən, sözanlayan; Bir nazlı yar olaydı.* (Bayatı).

**DİLBİLMƏZ** *sif.* və *is.* Başa düşməyən, anlamayan, söz qanmayan, gec başa düşən. *Dilbilməzin bir sözü; Sinəmdə qəm bağladı.* (Bayatı). *Puç eyləyən, övrət, bu gözəl, sadə cavanı; Dilbilməz oğul, vay!* M.Ə.Sabir. [Sultan bəy:] *Başa düşmürsən? Bəs elə isə, dürüst qulaq as, gör nə deyirəm, a dilbilməz!* Ü.Hacıbəyov.

**DİLBİLMƏZLİK** *is.* Başa düşməməzlik, söz qanmamazlıq.

**DİLBİR** *sif.* və *zərf* Sözü, fikri, sirri bir; əlbir, həmrəy, həmfikir. [Xudayar bəy:] *Yox, Vəliqulu, mən dəxi sənin sözünə inanmıram. Mən elə güman edirəm ki, anannan dilbirsən.* C.Məmmədquluzadə. [Kəyan] *..istəkli yoldaşı Maral ilə o qədər xoş, dilbir və ürəkbir həyat sürürdü ki, zövcəsinin bu sözünə ancaq ürəkdən gülər*(*di*). Ə.Əbülhəsən. ☐ **Dilbir eləmək (etmək), dilbir olmaq**

– sözbir olmaq, həmrəy olmaq, sözləşmək, qərarlaşmaq. [Zərbəli:] *..Hə, siz Nəzərəli çavuşnan dilbir olun, mənim oğlumu soldat yazdırın, öz uşaqlarınızı da gərmə qalağında gizlədin? Bu da bir qonşuluqdu?* C.Məmmədquluzadə. *Hər halda gümanım budur ki, əlbir, dilbir olsaq, Xanpəri xalanı düz yola gətirə biləcəyik.* Ə.Vəliyev.

**DİLBİRLİK** *is.* Söz birliyi, fikir birliyi, həmrəylik; sözləşmə.

**DİLCAVABI** *zərf* və *sif.* Şifahi, ağızdan. *Macəranın təfsilini, inşallah, özüm gələndə dilcavabı nağıl edərəm.* C.Məmmədquluzadə. *..Əmanətim də, dilcavabı sifarişim də var.* A.Şaiq. [Qasım:] *Heç olmasa, mənə aid maddələri dilcavabı de.* S.Rəhman.

**DİLCİK** *is.* Kiçik dil. // Dilə oxşar çıxıntı. *Ayanın qına keçən hissəsində pərdəşəkilli dilcik adlanan çıxıntı olur.* H.Qədirov.

**DİLCİKVARİ** *sif.* Dilciyə (kiçik dilə) oxşayan.

**DİLÇƏ** *is.* Kiçik dil; dil şəklində olan şey, alət və s.

**DİLÇƏK** *is.* 1. Ağız boşluğunda üst damağın dal tərəfində konusşəkilli çıxıntı. ☐ **Dilçəyi gəlmək** – dilçəyi şişmək. *Uşağın dilçəyi gəlib.*

2. *məc.* Hünər, bacarıq mənasında. *Dili varsa, dilçəyi də var.* (Ata. sözü). [Canəli] *belə odlu-odlu danışan adamın dilinə görə dilçəyi də var.* İ.Məlikzadə.

**DİLÇİ** *is.* Dilçilik alimi, dilçilik mütəxəssisi; dilşünas.

**DİLÇİLİK** *is.* Dil haqqında elm; dilşünaslıq.

**DİLDADƏ** *sif.* və *is.* [*fars.*] *klas.* Birisinə könül vermiş, vurulmuş, ürəyini bağlamış; məftun, vurğun, aşiq. *Dildadələrin dadrəsi, yavəri sənsən.* Q.Zakir. *Şair oldur ki, həqiqətlərə dildadə ola; Şairin fikri, xəyalı gərək azadə ola.* A.Səhhət. *Hökm eyləyəcəkmiş bütün aləmdə cəhalət; Dildadeyi-ürfanları neylərdin, ilahi?!* M.Ə.Sabir. // Sevgili, məhbubə.

**DİLDALAYAN** *is. bot.* Mal yemi kimi işlədilən beşyarpaqlı ot bitkisi.

**DİLDAR** [*fars.*] Bax **dilbər**. *Şəmsəddin elində, Tovuz çayında; Gözüm bu gün bir dildarə düşübdür.* Aşıq Dilğəm. *Mənə əvvəlcə özün yar oldun; Sevgilimsən deyə, dildar oldun.* M.Ə.Sabir. *Mən də bir cam ilə aram tutardım, saqi; Gər yetişsəydi əlim yari-dildarın əlinə.* Ə.Vahid.

**DİLDARLIQ** *is. köhn.* Təsəlli, təskinlik. ☐ **Dildarlıq vermək** – arxayın etmək, təskinlik vermək. *Məmmədbağır ona dildarlıq verirdi: – Əsmər, sən mənə inan!.. Mən alacağım arvadı axıradək saxlamayacağam.* S.Hüseyn. *Nümayəndələr .. onları danışdırdılar və dildarlıq verəndən sonra yenə də taxta skamyalar qoyulan yerə qayıtdılar.* P.Makulu.

**DİLDAŞ** *is.* Eyni dildə danışanlardan hər biri, eyni dildə danışan adam. *..Vətənin, həmcinslərin, həmvətənlərin və dildaşların təəssübü fərzdir, necə ki avropalıların adətidir, dini puç sayırlar.* M.F.Axundzadə.

**DİL-DƏLALƏT** bax **dəlalət**.

**DİLDƏN-DİLƏ** *zərf* Ağızdan-ağıza, ağızlardan, camaatın ağzından, başqalarından. *Hicran, əgərçi görməmişəm mübtəlaların; Dildən-dilə eşitmiş idim macəraların.* S.Ə.Şirvani. ☐ **Dildən-dilə düşmək (gəzmək)** – ağızlarda danışılmaq, yayılmaq, məşhurlaşmaq, dillərdə dastan olmaq. *Dildən-dilə düşdü bu fəsanə; Faş oldu bu macəra cəhanə.* Füzuli. *Mən çalik ürəkli bir yeni gəncəm: Dildən-dilə düşmüş hekayətim var.* M.Müşfiq.

**DİL-DİŞ** *top.* Ağızdakı dil və dişlər.

◊ **Dildə-dişdə dolaşdırmaq** – yaymaq, dillərə salmaq. *..Solmaz öz xəstə yatağında belə, Şiraslanı mülahizə edir, onu səsə-küyə salmaq, dildə-dişdə dolaşdırmaq istəmirdi.* S.Rəhimov. **Dilə-dişə düşmək** – ağızlarda danışılmaq, aləmə yayılmaq. *Rüstəmin özü də .. Qəhrəmanın özünün də bu qədər dilə-dişə düşməsindən narahat olurdu.* S.Rəhimov. *Başmaq məsələsi dilə-dişə düşdü.* Mir Cəlal. **Dilə-dişə salmaq** – ağızlara düşməsinə, aləmə yayılmasına səbəb olmaq, söz-söhbət üçün hədəf etmək, birinin sirrini, sözlərini camaat arasında yaymaq. *..Kişini* [Əntərzadəni] *dilə-dişə saldılar.* Mir Cəlal. *Ancaq gəl hələlik bunu dilə-dişə salmayaq.* Ə.Sadıq.

**DİL-DODAQ** *top.* Ağızdakı dil və dodaqlar.

◊ **Dil-dodağı kilidlənmək** – danışmağa qüdrəti olmamaq, lallaşan kimi olmaq. *Əsir dinmir, kilidlənmiş sanki dili-dodağı.* Ə.Cəmil. **Dil-dodağı qurumaq** – 1) bərk

susamaq; 2) təəccüb, heyrət içində qalıb danışa bilməmək, mat qalıb söz tapmamaq. **Dil-dodağı yanmaq** – b a x **dil-dodağı qurumaq** 1-ci mənada. **Dil-dodaq açmaq** – söz demək, danışmağa başlamaq. *Təhrik eyləməsə səba, qönçənin; Ağzı nədir aça dil-dodaq sənə.* Q.Zakir. **Dil-dodaq gəmirmək, dil-dodağını gəmirmək** – bərk acıqlanmaq, qəzəblənmək. *Zamanov, Əsgər danışdıqca bərk qızışır, əsəbiləşir və dil-dodağını gəmirirdi.* S.Rəhimov. *Məktub oxunub qurtarınca Əzizlə Səməd dil-dodağını gəmirir.* Ə.Vəliyev.

**DİLDÖNMƏZ** *is. ədəb.* Aşıq şeir formalarından biri (bu şeir formasında sözlər elə seçilir ki, dil səsləri, demək olar ki, iştirak etmir). *Aşıq Ələsgərin dildönməzləri.*

**DİLÉMMA** [*yun.*] İki mümkün (adətən arzu olunmayan) şeydən birini seçmə zərurəti.

**DİLETÁNT** *is.* [*fr.*] Xüsusi hazırlığı, sistematik biliyi olmadan hər hansı bir elm və ya sənətlə məşğul olan adam; həvəskar.

**DİLETANTLIQ** *is.* Xüsusi hazırlığı, biliyi olmadan bu və ya digər elm, ya sənətlə məşğul olma; həvəskarlıq. // Bir şeyə səthi münasibət.

**DİLƏFKAR** *sif.* və *is.* [*fars.*] *klas*. Könlü yaralı; dərdli, fikirli.

**DİLƏFRUZ** *sif.* [*fars.*] *klas*. Ürəkaçan, sevindirən, sevimli.

**DİLƏK** *is.* İstək, arzu, xahiş, tələb, təmənna. *Onların da var biz kimi ürəyi; Bir arzusu, bir eşqi, bir diləyi.* A.Səhhət. [Südabə Səyavuş haqqında:] *Bir diləyim varsa, – onun vüsalı.* H.Cavid. [Xədicənin] *hansı xahişi və diləyi yerinə yetirilmişdi ki, vəsiyyətlərinə də ehtiram edilə idi.* S.Hüseyn. ☐ **Dilək diləmək** – xahiş etmək, diləmək. *Dərdli Kərəm, diləyini dilə sən; Ağlayasan, sızlayasan, güləsən.* Aşıq Kərəm. **Dilək istəmək** – b a x **dilək diləmək**.

**DİLƏKLİ** *sif.* Diləyi olan, təmənnası olan; arzulu. *Bir diləkli min ürəklə; Alqış deyir bütün dillər.* S.Vurğun.

**DİLƏKSİZ** *sif.* Heç bir diləyi, təmənnası, arzusu, istəyi olmadan.

**DİLƏKSİZLİK** *is.* Heç bir diləyi, təmənnası, arzusu, istəyi olmama.

**DİLƏMƏ** "Diləmək"dən *f.is.*

**DİLƏMƏK** *f.* Arzu etmək, istəmək. *Zahid ölməkdən qabaq məqsudinə çatmaq dilər.* M.Ə.Sabir. *Sitarənin könlü daha əyləncələr diləməzdi, fikrindən də uşaqlar ilə laqeydanə oynamaq keçmirdi.* Çəmənzəminli. // Tələb etmək, xahiş etmək. *Bir vermə, bir də dilər; Yatmağa yer də dilər.* (Ata. sözü). *Canı canan diləmiş, verməmək olmaz, ey dil!* Füzuli.

**DİLƏNÇİ** *is.* 1. Dilənmək yolu ilə dolanan adam; yolçu. [Şamama Cadu:] *Doğrusu budur ki, mən dilənçi .. deyiləm.* Ə.Haqverdiyev. *Pirlər, ocaqlarda Münəvvər xanımın adı gələndə dilənçilər, əlillər qapıya hücum çəkirdilər.* Mir Cəlal. // *məc.* Daim ondan-bundan şey istəyən, başqalarında hər gördüyünü istəyən, acgöz adam haqqında.

2. *məc.* Çox yoxsul, çox kasıb, heç bir şeyi olmayan adam. *Yaz əkinçi, qış dilənçi.* (Ata. sözü). *Həm fəqirəm, həm dilənçi, həm məlik, həm padşah.* Nəsimi. *Ey mənim yolçu, dilənçi, lüt qardaşlarım!* C.Məmmədquluzadə.

**DİLƏNÇİLƏŞDİRİLMƏ** "Dilənçiləşdirilmək"dən *f.is.*

**DİLƏNÇİLƏŞDİRİLMƏK** *məch.* Dilənçi halına salınmaq.

**DİLƏNÇİLƏŞDİRMƏ** "Dilənçiləşdirmək"dən *f.is.*

**DİLƏNÇİLƏŞDİRMƏK** *f.* Dilənçi halına salmaq, bütün var-yoxundan məhrum etmək.

**DİLƏNÇİLƏŞMƏ** "Dilənçiləşmək"dən *f.is.*

**DİLƏNÇİLƏŞMƏK** *f.* Dilənçi halına düşmək, bütün var-yoxu əlindən çıxmaq.

**DİLƏNÇİLİK** *is.* Dilənçinin peşəsi; yolçuluq. *Xeyr, bu dilənçilik sifətini mən sizdə ehtimal eləmirəm.* C.Məmmədquluzadə. *Özgə kölgəsinə niyə sığındın; Səni alçaltmırmı bu dilənçilik?* B.Vahabzadə.

**DİLƏNÇİPAYI** *is.* Dilənçiyə verilən pul və s.; sədəqə.

**DİLƏNDİRMƏ** "Diləndirmək"dən *f.is.*

**DİLƏNDİRMƏK** *icb.* Dilənməyə məcbur etmək, dilənçi halına salmaq, dilənməsinə səbəb olmaq.

**DİLƏNMƏ** "Dilənmək"dən *f.is.*

**DİLƏNMƏK** *f.* 1. Dilənçilik etmək, yolçuluq etmək; sədəqə yolu ilə özgədən pul, çörək və s. istəmək. *Dilənmək qəsdilə düşüb*

*dərbədər; Gəzərsən bir evdə, pakizə düxtər.* Q.Zakir. *Dilənçi dedi: – Mən də elsiz-obasız bir qoca, dilənçiyəm. Kəndlərdə dilənirəm.* S.S.Axundov.

2. *məc*. Yalvarırcasına istəmək, ummaq. *O baxışlarda çırpınan ruhum; Dilənir gözlərindən istimdad!* A.Şaiq.

**DİLƏZBƏR(İ)** *is.* Əzbər, yadda saxlama. ◻ **Diləzbər etmək (eyləmək)** – yadda saxlamaq, heç vaxt yaddan çıxarmamaq. *Söyləyim sözlərim, eylə diləzbər; Şirin nəsihətim qıl sinədəftər.* "Koroğlu". **Diləzbər olmaq** – həmişə deyilmək, daim söylənmək, dildən düşməmək.

**DİLFİKAR** [*fars.*] *klas*. bax **diləfkar**. *Görəsənmi, yarəb, hansı dilfikar; Bu şəmirüxsarın pərvanəsidir?* Ə.Nəbati. *Heç yada salmazsan mən dilfikarı; Səni nə bimürvət yaradıb tarı?* Aşıq Məhəmməd.

**DİLFİRİB** *sif.* və *is*. [*fars.*] *klas*. Məftunedici, valehedici, canalıcı, füsunkar; gözəl. *Billah ki, bu dilfirib mənzil; Öylə mənə verdi rahəti-dil.* Füzuli. [Şeyx Sənan:] *O buludlar nə öylə rəngarəng? Bu nə qüdrət, nə dilfirib ahəng?* H.Cavid.

**DİLGİR** *sif.* [*fars.*] *köhn*. Ürəyisınıq, narazı, incik, dilxor, pərt. *Mən bir belə mövsümdə bahar axşamı dilgir; Bir lövheyi-eşq eylər idim qəlbdə təsvir.* A.Səhhət. *..Mənə giley yazan şagirdlərdən mən özüm çox artıq dərəcədə dilgirəm.* C.Məmmədquluzadə. ◻ **Dilgir etmək** – ürəyini sındırmaq, narazı etmək, incitmək, dilxor etmək, pərt etmək. **Dilgir olmaq** – ürəyi sınmaq, qəlbi qırılmaq, incimək, dilxor olmaq, pərt olmaq. *Birdən Rüstəm bəy öz sözlərindən dilgir olaraq pozuldu, bikef bir halda masanın kənarına çəkildi.* Çəmənzəminli. *Qoca Süleyman müvəffəqiyyətsizliyindən tez dilgir olaraq əliboş geri qayıtdı.* Ə.Məmmədxanlı.

**DİLGİRLİK** *is. köhn*. Ürəyisınıqlıq, narazılıq, inciklik, dilxorluq, pərtlik.

**DİLGÜŞA** *sif.* [*fars.*] *klas*. Ürəkaçan, könülaçan, fərəhverən, səfalı, şən. *Niqabın üzdən aç, ey gül; Kim, olsun dilgüşa məclis.* S.Ə.Şirvani. *Ancaq onu demək lazımdır ki, o vaxtdan gündən-günə bağ daha da dilgüşa və fərəhəfza bir mənzərə alırdı.* C.Cabbarlı.

**DİLXAH** *is*. [*fars.*] *köhn*. 1. Arzu, istək, könlün istədiyi şey. [Güləndam:] *İndi buna kələk qur, onun başın piylə, dilxahını əmələ gətir, özün qal aralıqda avara, sərgərdan.* N.Vəzirov. [Nadir bəy:] *..Bir qızı sərvəti üçün deyil, dilxah və tərbiyəli olduğu üçün alırlar.* H.Cavid.

2. **Dilxahdan** şəklində – ürəyi(n) istədiyi şeydən. *– Nədən mərcləşmək? – Dilxahdan!* (belə deyəndə uduzan adam udanın ürəyi istədiyi şeyi verməlidir).

**DİLXƏSTƏ** *sif.* [*fars.*] *klas*. Qəlbiqırıq, ürəyiincik, qəmli, kədərli. *Ey səba, mən aşiqi-dilxəstədən ol yarə var; Bülbüli-zarın dilindən gülşənü gülzarə var*. Xətayi.

**DİLXOR** *sif.* və *zərf* [*fars.*] Çox pərt, əhvalı pozulmuş, qəmgin, kədərli, məyus. *Məmmədhəsən əmi katdanı yola salıb oğlunun dalınca dilxor qoydu getdi evinə.* C.Məmmədquluzadə. *General bu gün çox dilxor idi.* S.Rəhman. ◻ **Dilxor etmək (eləmək)** – pərt etmək, əhvalını pozmaq, məyus etmək. *Nəhayət, Vaqif də tamamilə məsələyə dəxli olmayan söhbətlərə keçib, çar nümayəndəsini dilxor etdi.* Çəmənzəminli. [Mahmudu] *indi bircə şey dilxor edirdi.* Ə.Əbülhəsən. **Dilxor olmaq** – çox pərt olmaq, əhvalı pozulmaq, məyus olmaq. *Amma bir gün mən gənə bərk dilxor oldum.* C.Məmmədquluzadə. *Çingiz imzaları oxuduqda Qulunun imzasına rast gəldi, dilxor oldu, rəngi qaçdı.* Çəmənzəminli. *Yoldaşım çox dilxor olmuş və arabaçıya acıqlanmağa başlamışdı.* T.Ş.Simurq.

**DİLXORÇULUQ** *dan.* bax **dilxorluq**. [Qasım:] *Hə, bir az dilxorçuluqdur.* S.Rəhman.

**DİLXORLUQ** *is.* Pərtlik, inciklik, məyusluq, əhval pozğunluğu. *Araya dilxorluq salmaq. – Pirinin dilxorluğu bir anda sovuşdu.* İ.Əfəndiyev.

**DİLXOŞ** *sif.* [*fars.*] Ürəyi şad, fərəhli, razı, məmnun.

**DİLXOŞLUQ** *is.* 1. Şadlıq, fərəh, sevinc, məmnunluq. *Atası da dilxoşluq ilə oğluna baxırdı və görürdüm ki, oğlunun biliyinə qəlbdən çox-çox fəxr edirdi.* C.Məmmədquluzadə. *Hünər gələndə özü ilə şənlik və dilxoşluq gətirərdi.* Mir Cəlal.

2. *dan*. Zarafat, əylənmə, mazaqlaşma. ☐ **Dilxoşluq etmək** – zarafatlaşmaq, əylənmək, mazaqlaşmaq. *Qulammirzə axşam teatrdan qayıdanda yataq otağında arvadı yatmış görür. Çarpayının kənarında əyləşir, dilxoşluq edir.* Çəmənzəminli.

**DİLXUN** *sif.* [*fars.*] *klas*. Ürəyi qanlı, qəlbi yaralı, çox kədərli, çox dərdli. ☐ **Dilxun etmək (qılmaq)** – ürəyini yaralamaq, çox kədərləndirmək, çox dərdləndirmək. *Ey gözləri cəllad, qaməti mövzun; Bu qədər bəndəni eyləmə dilxun.* Aşıq Kərim. *Qıldı dilxun naleyi-biintihası bülbülün*. Ə.Nəzmi.

**DİLİACI** b a x **acıdil**.

**DİLİACILIQ** b a x **acıdillik**.

**DİLİBOZ** *sif. dan.* Dildən kobud, qabadanışan.

**DİLİCAN** *is.* [*fr.*] Keçmişdə dördtəkərli poçt, ya minik arabası.

**DİLİGÖDƏK** *sif.* Birinin yanında eybi, nöqsanı, qüsuru, yaxud sirri olduğu üçün hal və hərəkətində inamı və cəsarəti olmayan; danışmağa, söz söyləməyə, yaxud etiraz etməyə haqqı olmayan.

**DİLİGÖDƏKLİK** *is*. Birinin yanında eybi, qüsuru, nöqsanı, yaxud sirri olduğu üçün danışmağa, söz söyləməyə, yaxud etiraz etməyə haqqı olmadığını hiss etmə. *Diligödəkliyi də o babətdən idi ki, Münəvvər xanımın binadan-başdan uşağı olmurdu.* Mir Cəlal.

**DİLİK** *is.* 1. Nəyinsə uzunsov hissəsi.

*2. köhn.* Bəzək.

**DİLİK-DİLİK** *sif.* 1. Kənarı diliklər şəklində olan. *Kənarı dilik-dilik süfrə.*

2. Tikə-tikə, parça-parça. ☐ **Dilik-dilik etmək** – parça-parça etmək, tikə-tikə etmək. **Dilik-dilik olmaq** – parçalanmaq, parça-parça olmaq. *O, kağızı cırıb atdı, dilik-dilik olan xırdaca kağız parçaları kəpənək kimi havada uçub yerə tökülənə qədər Tərlan kirpiklərini qırpmadı.* M.Hüseyn. **Dilik-dilik olasan (olsun)!** – qarğış ifadəsi. [Fatma xanım:] *A qız, sən öyrətmədin gədəni ki, mənə xoruzbeçə desin, a səni görüm dilik-dilik olasan!* N.Vəzirov.

**DİLİKƏSİK** b a x **diligödək**.

**DİLİKLƏMƏ** "Dilikləmək"dən *f.is.*

**DİLİKLƏMƏK** *f.* Dilik-dilik etmək, diliklər şəklinə salmaq. *Haşiyə taxtasını dilikləmək. Paltar ətəyini dilikləmək.*

**DİLİKLƏNMƏ** "Diliklənmək"dən *f.is.*

**DİLİKLƏNMƏK** *məch*. Dilik-dilik edilmək, diliklər düzəldilmək.

**DİLİKLƏTMƏ** "Diliklətmək"dən *f.is.*

**DİLİKLƏTMƏK** *icb*. Dilik-dilik kəsdirmək, diliklər düzəltdirmək. *Yaylığı diliklətmək.*

**DİLİKLİ** *sif.* Diliyi, ya dilikləri olan. *Dilikli yaxalıq. Ətəyi dilikli paltar. Dilikli qala divarları.*

**DİLİQISA** b a x **diligödək**.

**DİLİQISALIQ** b a x **diligödəklik**.

**DİLİM** *is.* Uzununa dil kimi kəsilmiş parça, ya bu cür hissələrə ayrılmış bir şeyin hər parçası. *Portağal dilimi. Qovundan bir dilim kəs. – Bürcəliyev çiynini ata-ata güldü, onun .. yemiş dilimi kimi ağaran kəlləsi .. atılıb-düşdü.* S.Rəhimov. *Ortalıqda qarpız dilimləri vardı.* Ə.Əbülhəsən. ☐ **Dilim çəkmək** – bir şeyin üzərində dilim kimi izlər əmələ gətirmək. *Çörəyə dilim çəkmək*.

**DİLİM-DİLİM** *zərf* və *sif.* Dilimlər halında, dilimlər şəklində. *Dilim-dilim kəsmək. Dilim-dilim etmək. Qovunu dilim-dilim doğrayıb boşqaba yığmaq.* – [Gülsənəm] *..balaca stolun üstünə dilim-dilim doğradığı təndir çörəyi ilə bərabər, yağ, bal və pendir düzmüşdü.* M.Hüseyn. *Dilim-dilim kəsildi; Taşhavuz qovunları.* S.Rüstəm. // Uzun dillər halında yuxarı qalxan. *Dilim-dilim alov kimi baxışlardan qəzəb yağır.* S.Vurğun. *Alov buxağının bacasından dilim-dilim qalxdıqda Qərənfil xala yağı əritmək üçün sapılcanı ocağın üstünə qoydu.* Ə.Vəliyev. ☐ **Dilim-dilim olmaq** – tikə-tikə olmaq. *Sonra o, dilim-dilim olmuş yaylığının ucu ilə çuxura düşmüş balaca boz gözlərini sildi.* S.Rəhimov. **Dilim-dilim olasan, dilim-dilim olmuş** – qarğış ifadəsi. // Cizgilər, şırımlar, zolaqlar halında olan.

**DİLİMLƏMƏ** "Dilimləmək"dən *f.is.*

**DİLİMLƏMƏK** *f.* Dilim şəklində doğramaq, dilim-dilim kəsmək. *Qarpızı, qovunu dilimləmək. – Hamı evin qabağında qoyulan və üstünə xalça salınan taxta əyləşdi, yemişi kəsib dilimlədilər*. Mir Cəlal.

**DİLİMLƏNDİRMƏ** "Dilimləndirmək"-dən *f.is.*

**DİLİMLƏNDİRMƏK** *f.* Dilim şəklinə salmaq, dilimləmək.

**DİLİMLƏNMƏ** "Dilimlənmək"dən *f.is.*

**DİLİMLƏNMƏK** *məch.* Dilim şəklində doğranmaq, dilim-dilim kəsilmək. *Yarımkürəyə oxşayan qarpız parçasının biri dilimlənərək yeyilmişdi.* M.İbrahimov.

**DİLİMLƏTMƏ** "Dilimlətmək"dən *f.is.*

**DİLİMLƏTMƏK** *icb.* Dilim şəklində doğratmaq, dilim-dilim kəsdirmək.

**DİLİMLİ** *sif.* Dilimi olan, dilim-dilim.

**DİLİR** *sif.* [*fars.*] *köhn.* İgid, qəhrəman, şücaətli.

**DİLİŞİRİN** *sif.* 1. Mehriban, sevimli, qanıisti. *Dilişirin uşaq.*

2. Danışarkən bəzi səsləri, məs.: "s"-ni "ş", "k"-ni "c" kimi tələffüz edən adam haqqında.

**DİLİŞİRİNLİK** *is.* Mehribanlıq, qanıistilik, sevimlilik.

**DİLİUZUN** *sif.* İşində, hərəkətində heç bir nöqsan və qüsur olmadığını duyduğu üçün, işində müvəffəq olduğu üçün cəsarətlə danışmağa, iddialanmağa özünü haqlı bilən.

**DİLİUZUNLUQ** *is.* Dili uzun olma. ☐ **Diliuzunluq eləmək** – yerli-yersiz danışmaq, yaxud özünə aid olmayan söhbətə qarışmaq.

**DİLİ-ZAR** [*fars.*] *klas. şair.* Ürəyi dağlı, ürəyi yaralı. *Qıldı kənar zülfünü rüxsari-yardən; Verdi nəsimi-sübh dili-zardan xəbər.* S.Ə.Şirvani. *Hər dərdü-qəmin mən çəkirəm, kam alan özgə; Rəhm eyləməsin qoy dili-zarə, özü bilsin.* Ə.Vahid.

**DİLKEŞ** *sif.* [*fars.*] *klas.* 1. Ürəkaçan, könülaçan, qəlbi sevindirən. *Ey camalı günəş, zülfləri dilkeş; Cana saldın atəş, çıxanda sərxoş.* M.P.Vaqif. *Ol mənzəreyi-dilkeşə min çeşmlə guya; Bir riqqət ilə çərx özü eylərdi təmaşa.* A.Səhhət.

2. Azərbaycan klassik muğamlarından birinin adı.

**DİLQANADAN** *is. bot.* Bəzi növlərinin tərkibində rəng və dərman maddələri olan birillik və çoxillik ot bitkisi.

**DİLQANAN** b a x **dilbilən**.

**DİLLƏNDİRMƏK** *icb.* 1. Dillənməyə, danışmağa, söyləməyə məcbur etmək. *Dərdliyə söz deməyin; Dərd onu dilləndirər.* (Bayatı). [Əntiqəni] *dindirib dilləndirmək mümkün olmurdu.* Mir Cəlal.

2. *məc.* Çalmaq, səsləndirmək; səs çıxarmağa məcbur etmək, dilə gətirmək. *..Bəxtiyar uzaqdan tarın simlərini dilləndirir.* A.Şaiq. *Qocaman ustalarımızdan Bakıxanov tarı dilləndirir.* S.Rüstəm.

**DİLLƏNDİRİLMƏ** "Dilləndirilmək"dən *f.is.*

**DİLLƏNDİRİLMƏK** *məch.* Dillənməyə, danışmağa, söyləməyə məcbur edilmək; danışdırılmaq, dilə gətirilmək.

**DİLLƏNDİRMƏ** "Dilləndirmək"dən *f.is.*

**DİLLƏNMƏ** "Dillənmək"dən *f.is.*

**DİLLƏNMƏK** *f.* 1. Danışmaq, dilə gəlmək, ağzını açıb söz söyləmək. *Sevincindən gözləri yaşaran ana dilləndi.* S.Rəhman. *Tahirzadə dillənən kimi sükut bərpa olundu.* Mir Cəlal.

2. Səs çıxarmaq, oxumaq, ötmək; çalmaq. *Bülbüllər axşam-səhər; Budaqlarda dillənir.* A.Şaiq.

**DİLLƏŞMƏ** "Dilləşmək"dən *f.is.*

**DİLLƏŞMƏK** *f.* 1. Danışmaq, bir-biri ilə söhbət etmək. *Ləzzət olur yar-yar ilə dilləşə; Hicran çəkib çiçəklənə, gülləşə.* Xəstə Qasım. // Məc. mənada. *Quşlar bu tellər üstündə oturub dilləşirlər.* Mir Cəlal.

2. Bəhsləşmək, mübahisə etmək, sözə gəlmək, sözləşmək. *Müdirlə dilləşmək. Qonşu ilə dilləşmişdi.*

3. *məc.* Qabaqcadan danışıb sözbir eləmək, razılığa gəlmək, qərarlaşmaq, dilbir olmaq. *Son iclasda özlərini necə aparmaq üçün dilləşmək istəyənlər .. toplanmışdı.* M.S.Ordubadi. *Bu məsələ dilləşmədən belə, hər iki cavanın arasında qət olundu.* S.Rəhimov.

**DİLLİ** *sif.* 1. Ağzında dili olan. // Danışa bilən, danışmağa qadir olan.

2. *məc.* Dilavər, danışmaqda usta və cəsarətli. *Dilli balalar isə, – "Ana, suyumuz yoxdur", – deyib boyunları buruq cavab verirlər.* N.Nərimanov. *O məni, mən onu sevdiyimdən daha artıq sevirdi, gözəl idi, dilli*

*və bacarıqlı idi.* M.S.Ordubadi. // Çoxdanışan. *Dilli adam. Dilli qız.*

3. Dili olan (b a x **dil**[1] 7-ci mənada). *Yasavul .. dilli, enli qayışını boynundan aşırmış, köynəyinin yaxasını açmışdı.* S.Rəhimov.

**...dilli** – bir sıra sözlərə qoşularaq, dil (2, 5 və 7-ci mənalarda) ilə bağlı mürəkkəb sifətlər düzəldilir; məs.: ikidilli lüğət, xoşdilli adam, qoşadilli açar.

**DİLLİ-AĞIZLI** *sif.* Şirin danışıqlı, xoş danışan, nəzakətli; dilli (2-ci mənada). *İnanırıq, görürük ki,* [Həsənağa] *çox dilli-ağızlı gənc olduğu kimi, .. hər bir hərəkətində səmimi olduğunu göstərirdi.* M.S.Ordubadi. *Yaxşı işləyir, dilli-ağızlıdır, haqq-ədalətnən baxandır.* Mir Cəlal.

**DİLLİ-DİLAVƏR** b a x **dilli** 2-ci mənada. [Əsmərdə] *bir duyğu oyanırdı: Ziba kimi bacarıqlı, dilli-dilavər, zirək bir qız olmaq.* S.Hüseyn. *Təbabətə aid cihazların adlarını, yerini əzbər bilən, dilli-dilavər bir şəfqət bacısı hazırlaya bilmişdi.* M.İbrahimov.

**DİLLİ-DİLAVƏRLİK** *is.* Dillilik, dilavərlik. *Katib, qızın zirək, dilli-dilavərliyi haqqında ilk zənninin doğru olmağından məmnun bir halda .. asfalt yola baxdı.* Mir Cəlal.

**DİLLİ-FEİLLİ** *sif.* 1. B a x **dilli-dilavər**.

2. Danışqan və çalışqan.

**DİLLİLİK** *is.* Dilli adamın xassəsi, çox danışma, danışqanlıq. ☐ **Dillilik eləmək** – çox danışmaq, diliuzunluq etmək. *..Uşaq, adəti xilafına olaraq, bu axşam bir az dillilik eləyirdi.* Ə.Əbülhəsən.

**DİLMANC** *is. köhn.* 1. Çar dövründə məhkəmədə və ya bəzi başqa idarələrdə tərcüməçi. [Məşədi İbad:] *Rüstəm bəy! Çox adamlar mənimlə qohum olmaq istədilər, hətta qubernatın dilmancı Cəfər bəyin xalası oğlu Daşdəmir bəy.* Ü.Hacıbəyov. *Məmmədhəsən əminin sözünü nə dilmanc, nə də ki nəçərnik başa düşə bilmədilər.* C.Məmmədquluzadə. *Baxacaq işinə hərbi məhkəmə; Etdi bu sözləri dilmanc tərcümə.* H.K.Sanılı. // Bəzən ikidilli lüğət mənasında işlənmişdir.

2. *məc*. Vasitəçi mənasında. *Yarım utancaq olsa; Tutub dilmanc saxlaram.* (Bayatı). [Ağa Nəriman xan:] *Bədircahan, barı sən dilmanc ol bizim aramızda..* N.Vəzirov.

**DİLMANCLIQ** *is. köhn*. Dilmancın (1-ci mənada) işi, vəzifəsi; tərcüməçilik. *Qulluğumun adı dilmanclıq idi.* C.Məmmədquluzadə. *Bu cür dilmanclığın özünün də kənd arasında heç az hörməti olmurdu.* S.Rəhimov.

**DİLNƏVAZ** *sif.* [*fars*.] *klas. şair*. Könlü oxşayan, ürəyəyatan, son dərəcə xoş. *Onun söhbətləri musiqi nəğmələrindən dilnəvaz və sevimlidir.* M.S.Ordubadi. *Dünyaya gəlməyib elə bir nazənin gözəl; Dərd əhlinə təsəlli verə, dilnəvaz ola*. Ə.Vahid.

**DİLORTASI** *sif. dilç*. Dilin orta hissəsinin iştirakı ilə tələffüz edilən. *Dilortası səslər*.

**DİLOTU: dilotu yemək** – həddindən artıq çox danışmaq, birnəfəsə danışmaq, başqalarını danışmağa qoymayıb özü danışmaq. [Qız] *dilotu yeyib, ona söz çatdırmaq olar?* M.Hüseyn. *Qumru .. Babacanın dilotu yemiş kimi tökdüyü dillərinə qulaq asırdı.* Ə.Əbülhəsən.

**DİLOV** *is. məh.* Divar şkafı, taxça, caxmudan.

**DİLÖNÜ** *sif. dilç*. Dilin ön hissəsinin iştirakı ilə tələffüz edilən. *Dilönü saitlər. Dilönü samitlər. Ə, e, i, ö, ü dilönü səslərdir*.

**DİLPƏSƏND** *sif.* [*fars.*] *klas*. Xoşagələn, ürəyəyatan. *Pəriyəm, söylərəm şahü-gədadən; Qafiyə dilpəzir gərək binadən.* Aşıq Pəri.

**DİLRÜBA** *sif.* və *is*. [*fars*.] *şair*. Ürəyi cəlb edən, ürəkçəkən, xoşagələn, məftunedici. [Böyükxanım] *gah-gah öz-özünə dilrüba bir səslə oxuyub ayaqlarını oynadırdı.* M.S.Ordubadi. *..Azərşəhr, doğrudan da, Azərbaycanın dilrüba bir guşəsidir.* M.İbrahimov. // Dilbər, gözəl, canan. *Şəninə dedim şirin söz, bir şey ondan dadmadım; Bu səbəbdən ağzı şəkkər dilrübadən küsmüşəm.* M.P.Vaqif. *Xəyali-yar edib aldım bu şəb ol dilrübadan həzz*. S.Ə.Şirvani. [Dərviş:] *Gecələr bu dilrübanın keşikçisi, gündüzlər qulu oldum.* A.Divanbəyoğlu.

**DİLSİZ** *sif.* və *is.* 1. Dili olmayan, lal. // *məc*. Səssiz, cansız. *Sanki bütün adamlar daş kimi dilsiz və cansız idi.* M.İbrahimov. *Nə balıqlar danışırlar; Nə də cansız dilsiz daşlar.* M.Seyidzadə.

2. *məc*. Yazıq, fağır, aciz, müti, sakit, həlim, dinməz (adam). *Dilsizlər hərə bir küncdə palçığa bulanmış, aclıqlarından nalə edirlər.* N.Nərimanov.

**DİLSİZ-AĞIZSIZ** b a x **dilsiz** 2-ci mənada. *..Dilsiz-ağızsız, fəqir və yazıq anaların südünü əmən balalardan qorxaq, aciz və bacarıqsız nəsil əmələ gələcəkdir.* F.Köçərli. *Hər kəs* [Ənisəni] *dilsiz-ağızsız, bacarıqsız bir talibə zənn edirdi.* S.Hüseyn. // İs. mənasında. *Belə hərc-mərclikdə onun kimi dilsiz-ağızsızlar taləfə gedə bilərlər*. S.S.Axundov. // *zərf* Səssizcə, dinmədən, danışmadan, susaraq. *Lal Hüseyn yenə dilsiz-ağızsız oturub kirpik çalmadan baxırdı.* M.İbrahimov.

**DİLSİZLİK** *is.* 1. Lallıq.

2. *məc*. Yazıqlıq, fağırlıq, həlimlik, mütilik, acizlik, sakitlik.

3. *məc*. Səssizlik, sükut. *Yadımdadır o gün ki, sən sərilmişdin yatağa; Qara ölüm dilsizliyi çökmüşdü dil-dodağa.* A.Şaiq. *Burada* [qəbiristanda] *hər şey dilsizlik içərisində idi.* S.Rəhimov.

**DİLSUZ** *sif.* [*fars.*] *klas*. 1. Ürəkyandıran, çox təsirli. *Bir oddur eşqi-dilsuzun ki, daşlar içrə pünhandır.* Füzuli. *Bu Xətayinin dilində eşqi-dilsuzun sənin; Oda bənzər kim, həmişə dil kəbab üstündədir.* Xətayi.

2. Ürəyiyanan, həssas, şəfqətli.

**DİLŞAD** *sif.* [*fars.*] *klas*. Ürəyi şad, könlü şad, fərəhli. *Bir ləhzə bəzmi-yardə dilşadəm, ey könül; Aram tut, bu mətləbi biganə bilməsin.* M.Ə.Sabir. ☐ **Dilşad etmək (eyləmək)** – ürəyini şad etmək, sevindirmək, fərəhləndirmək. *Ol edir kimini dilşad, kimini məhzun.* Q.Zakir. *Vay o gündən ki, məni ad elədiz; Elə bildiz də ki, dilşad elədiz.* M.Ə.Sabir. **Dilşad olmaq** – ürəyi şad olmaq. *Səni sevən olur həmişə dilşad; Soyun adəmidir, cinsin pərizad.* M.P.Vaqif. *Piri-meyxanə bu işdən təki dilşad olsun.* S.Ə.Şirvani. *Vaqif ancaq öz dostundan yetişən kağızdan xoşhal və dilşad olub.* F.Köçərli.

**DİLŞADLIQ** *is.* Könül şadlığı, sevinc, fərəh. *Mən bu dudmanı həmişə abad və içində dilşadlıq görmüşəm.* Ə.Haqverdiyev.

**DİLŞİKƏSTƏ** *sif.* [*fars.*] *klas*. Ürəyisınıq, könlüqırıq, bədbəxt, yazıq, biçarə. *Bir gün Məcnuni-dilşikəstə; Səhrada gəzirdi zarü xəstə.* Füzuli. *Hal pərişan, dilşikəstə olduğum; Deyən varmı biinsafa, görəsən?* Q.Zakir.

**DİLŞİKƏSTƏLİK** *is. klas*. Ürəyisınıqlıq, könlüqırıqlıq, yazıqlıq, biçarəlik.

**DİLŞÜNAS** b a x **dilçi**. *Bundan əlavə, əlifbamızda olan nöqsanlardan başqa, ərəb dilini öyrənmək bizim üçün, dilşünas olmadığımıza görə, başqa bir çətinlik də törədir.* M.F.Axundzadə.

**DİLŞÜNASLIQ** b a x **dilçilik**.

**DİLTƏNG** *sif.* [*fars.*] *köhn*. Ürəyi sıxılmış, könlü daralmış, kədərli, qəmgin, məyus. ☐ **Diltəng etmək** – ürəyini sıxmaq, kədərləndirmək, təngə gətirmək. *Dinməz və söyləməz oturmağımız məni diltəng etdiyinə görə* [dərvişlə] *söhbət başlamaq qəsdi ilə sordum.* A.Divanbəyoğlu. **Diltəng olmaq** – ürəyi sıxılmaq, qanı qaralmaq, kədərlənmək, qəmlənmək, pərt olmaq. *Mən o səbəbdən diltəng oldum ki, bu bir saatın içində doqquz manatı tapmasam, məcmuə dəxi bir gün də təxirə düşəcəkdir.* C.Məmmədquluzadə. *Od, tüstü içində etmişəm cəng; Heç olmamışam bu növ diltəng.* A.Səhhət. *Əhməd bəy bundan da diltəng olub, həmişəlik xanənişin olub altı-yeddi sənə evindən çıxmadı.* Ə.Haqverdiyev.

**DİLTƏNGLİK** *is.* Canı sıxılma, dilxorluq, qəmginlik, məyusluq; kədər. *Molla İbrahimxəlil şiddətli diltənglik ilə dedi..* M.F.Axundzadə.

**DİLTƏRPƏNMƏZ** b a x **dildönməz**.

**DİLUCU**[1] *sif. dilç.* Dil ucunun iştirakı ilə əmələ gələn. *Dilucu səs*.

**DİLUCU**[2] *zərf* Könülsüz, ürəksiz, ötəri, qısaca. *Dilucu söyləmək. Dilucu cavab vermək.* – *Oturanlar hamısı baş əyib dilucu salam verirdilər.* Mir Cəlal.

**DİLVARİ** *sif.* Dil kimi, diləoxşar, dil şəklində.

**DİMAĞ** *is.* [*ər.*] Beyin. // *məc.* Ağıl, şüur. *Mey gərçi səfa verər dimağə; Axdığı üçün düşər əyağə.* Füzuli. *Bu sözlər Tanyaya olduqca təsir etdiyindən, onun qəlbində, dimağında bir dəyişiklik törətdi.* A.Şaiq. *Murad gözlərini açdı. Ayağa qalxdı, dimağına hücum edən qara fikirləri özündən uzaqlaşdırmaq istədi.* S.Hüseyn.

◊ **Dimağı çağ olmaq** – b a x **damağı çağ olmaq** (**"damaq**[2]**"**da). *Güllər açıldı, dimağı*

*çağ oldu dilbərin; Saqiya, ver badeyi-gülgün ki, çağ olsun dimağ.* S.Ə.Şirvani.

**DİMDƏLƏMƏK** *f. məh.* Dürtməkləmək, dürtməklə vurmaq. – *Heç dəli olmasa, o yekəlikdə də adama dəli deyərlərmi? – deyə arvad ərini dimdələdi.* S.Rəhimov.

**DİMDÍK** *is.* Quşların ağızlarının irəliyə uzanmış buynuz kimi sərt hissəsi. *Ağacdələnin dimdiyi biz kimi olur. Qırğının əyri və sərt dimdiyi. – Quşlar yuvalarında oturub dimdiklərini təmizləyirdilər.* N.Nərimanov. [Buğacın] *tərlan dimdiyinə bənzər zərif burnu .. yuvarlaq üzünə xüsusi bir yaraşıq verirdi.* M.Rzaquluzadə.

**DÍMDİK** *zərf* və *sif.* 1. Çox dik, lap dik, tamam dik. *Dimdik qoyulmuş dirək. Dimdik yer. – Qurban tikan kimi dimdik duran qıllarını arxalığının yaxalığı ilə sıx-sıx örtərək .. dedi.* A.Şaiq. [Rüstəm bəy:] *Cansız və ruhsuz bir sütun kimi dimdik qaldı.* Çəmənzəminli.

2. Düz, ayaq üstə durmuş halda. [Yusif] *hirsindən ayağa qalxıb dimdik dayandı.* Ə.Vəliyev.

**DÍMDİKBURUN** *sif.* Burnu dimdik kimi əyri və ucu iti.

**DİMDİKDİBİ** *is. zool.* Bir qrup quşlarda dimdiyin dibindəki dərinin qalınlaşmış hissəsi.

**DİMDİKLƏMƏ** "Dimdikləmək"dən *f.is.*

**DİMDİKLƏMƏK** *f.* 1. Dimdiyi ilə götürüb yemək. *Biixtiyar ovcumdakı dəni yerə səpərdim, cücələr bir-birini döşləyərək səpdiyim dəni dimdiklərdi.* A.Şaiq.

2. Dimdiyi ilə vurmaq, dişləmək, döymək. *Qızılquş pəncəsindən qurtulub, özünü insan əlində əsir görən kəklik qurtulmaq üçün həyəcanla çırpınır, əllərimizi dimdikləyirdi.* A.Şaiq. *Ata və ana qarğa Nurəddinin başı üstünü alıb elə həşir saldılar ki, deyəsən, bu saat onu dimdikləyib yerə salacaqdılar.* S.S.Axundov. [Əli əmniyyəbaşı] *bir-birini dimdikləyib hinə doluşan toyuqlara baxdı.* M.İbrahimov.

**DİMDİKLƏNMƏ** "Dimdiklənmək"dən *f.is.*

**DİMDİKLƏNMƏK** *qayıd.* Öz-özünü dimdiyi ilə təmizləmək, dimdiyi ilə təmizlənmək. *Bir qara toyuq gəlib Maronun yaxınlığındaca dimdikləndi.* S.Rəhimov.

**DİMDİKLƏŞMƏ** "Dimdikləşmək"dən *f.is.*

**DİMDİKLƏŞMƏK** *qarş.* 1. Bir-birini dimdiklə vurmaq, dişləmək, döymək. *Xoruzlar həyətdə dimdikləşir.*

2. *məc.* Dalaşmaq, çeynəşmək, yola getməmək.

**DİMDİKLİ** *sif.* 1. Dimdiyi olan. *..Həyətdə dənlənən yastı sarı dimdikli qazların hərdənbir qaqqıltısından başqa bir şey eşidilmirdi.* Ə.Əbülhəsən.

2. Dimdiyəoxşar ağzı, ya qapağı olan. *Daxilə işlənən damcı dərmanları damcılamağı normal və asan olan dimdikli şüşələrdə buraxmaq lazımdır.* R.Əliyev.

**DİMDİRİ** *sif.* Çox diri, çox çevik, çox zirək, çox cəld.

**DİMEDROL** *is. tib.* Yuxu və allergiya dərmanı.

**DİN** *is.* [*ər.*] 1. Xariqüladə qüvvələrə, varlıqlara inanmağı əsas götürən, Tanrıya etiqadı və tapınmağı sistemləşdirən ictimai şüur forması. *Qorxu hissi yanlış olaraq dinin meydana gəlməsinin səbəbi sayılırdı. Din bəşəriyyət tarixinə hakim olan ən böyük qüvvətdir. Fəlsəfənin də, elmin də qaynağı dindir.*

2. Həmin inam və etiqadları ayin və mərasimlər şəklində özündə toplayan dünyagörüşü, davranış və spesifik fəaliyyət. *İslam dini. Xristian dini. Budda dini. Dini ayinlər.*

◊ **Dindən-dondan çıxmaq** – yorulmaq, usanmaq.

**DÍNA** *is.* [*yun.*] *fiz.* Kütləsi bir qram olan cismə bir saniyədə bir santimetr təcil verən qüvvə.

**DİNAB** b a x **dənab**.

**DİNAMÍK** *sif.* [*yun.*] 1. Dinamikaya aid olan; hərəkətlə, gücün təsiri ilə əlaqədar olan. *Dinamik buxarlanma. Dinamik üsul. Dinamik müvazinət.*

2. Hərəkəti, təsiri, daxili qüvvəsi çox olan, daim hərəkətdə olan. *Dinamik surət. Aktyorun dinamik oyunu. – İ.P.Pavlov qan dövranının fiziologiyasını öyrənərək, ürək fəaliyyətinin xüsusi dinamik sinirlər vasitəsilə nizama salındığını kəşf etmişdir.* A.Qarayev.

**DİNÁMİKA** [*yun.*] 1. Mexanikanın, qüvvə təsirindən asılı olaraq cisimlərdə əmələ gələn hərəkətin qanunlarından bəhs edən şöbəsi.

*Dinamikanın əsas məqsədi cisimlərin hərəkətini öyrənməkdən ibarətdir.* Z.Xəlilov.

2. Bir şeyin hərəkət halı, inkişafının, dəyişməsinin gedişi. *Dövlət büdcəsinin dinamikası. Əmək məhsuldarlığının dinamikası. Hadisələrin dinamikası. // məc.* Hərəkət. *Əsərdə dinamika yoxdur. Pyesdəki dinamika. Oyunun dinamikası. – İkinci və üçüncü pərdələrdə hərəkət xeyli ləngiyir, xırda hadisələr uzanır. Ancaq tamaşanın sonuna doğru, xüsusən son şəkillərdə dinamika artır.* M.Arif.

**DİNAMİKALI** *sif.* Dinamikası olan, dinamik.

**DİNAMİKLİK** *is.* Dinamikası, hərəkəti, daxili qüvvəsi bol olma. *Əsərdə dialoqun dinamikliyi. Baletdə kütləvi səhnələrin dinamikliyi.*

**DİNAMİ́T** [*yun.*] Əsas tərkib hissəsi nitroqliserindən ibarət olub, dağları, qayaları partlatma işlərində və s.-də istifadə edilən partlayıcı maddə. *Binanın divarlarına dinamit qoyduqda xalqla bərabər biz də keçib getdik.* M.S.Ordubadi. *Surxay partladılacaq qayaya göz gəzdirdi. Dinamit qoydurdu.* M.İbrahimov.

**DİNAMİTÇİ** *is. xüs.* Dinamitlə partlayış işləri aparan mütəxəssis.

**DİNAMİTLİ** *sif. xüs.* Dinamiti olan. *Dinamitli bomba.*

**DİNAMİ́ZM** [*yun.*] bax **dinamiklik**.

**DİNÁMO** [*yun.*] bax **dinamomaşın**.

**DİNAMO-MAŞIN** [*yun.* dynamis və *fr.* machine] Daimi elektrik cərəyanı hasil edən maşının köhnə adı; elektrik generatoru.

**DİNAMÓMETR** [*yun.* dynamis və metreo – ölçürəm] *tex.* Dartı qüvvəsini və fırlanma momentini ölçmək üçün cihaz.

**DİNAR** *is.* [*ər.*] 1. *tar.* Yaxın Şərqin bəzi ölkələrində qızıl pul. [Əli xan] *dirhəm və dinar təmənnasında olmayıb.* M.F.Axundzadə. [Qızıltac:] *Mən hökmdarın xəzinəsinə düz iyirmi min dinar vermişəm.* M.Hüseyn. // İranda: xırda pul. *Hesab var dinarla, bəxşiş var xalvarla.* (Ata. sözü).

2. İraqda və Yuqoslaviyada pul vahidi.

**DİNC** *sif.* 1. Başqasını narahat etməyən, əziyyət verməyən, yalnız öz işi ilə məşğul olan; sakit. *Məmmədhəsən əmi dinc adamdır.* C.Məmmədquluzadə. *Yox, qardaş, .. uşaq çox dinc uşaqdır.* S.Rəhman. ◻ **Dinc buraxmamaq** – narahat etmək, rahat qoymamaq, daim narahat etmək. [Sərdar Rəşid] *məni dinc buraxmırdı.* M.S.Ordubadi. **Dinc durmaq** – başqalarına toxunmamaq, narahat etməmək. [Xəlifə:] *..Dinc durun, yazıq-yazıq orada uzanıbdır, tazı kimi ləhləyir.* C.Cabbarlı; // sakit durmaq, şuluqluq, dəcəllik etməmək. *Saribani-qəza dedi ki, dinc dur!* Q.Zakir. **Dinc durmamaq (oturmamaq)** – başqalarını narahat etmək, sataşmaq, nadinclik etmək, sakit durmamaq. *Şəki xanı Hacı Əbdülqədir də dinc durmur.* Çəmənzəminli. *Nəbi burada dinc oturmayıb bəylərə dolaşır.* "Qaçaq Nəbi". **Dincə qoymaq** *k.t.* – torpağın məhsuldarlığını bərpa etmək üçün bir müddət onda heç bir şey əkməmək. **Dincə qoyulmaq** – məhsuldarlığı bərpa edilmək üçün bir müddət heç bir şey əkilməmək (torpaqda). *..Bu yer ağır yerdir, çoxdandır ki, dincə qoyulmamışdır.* N.Vəzirov. **Dincini almaq** – istirahət etmək, tənəffüs etmək, dincəlmək. [1-ci əcinnə:] *Yoruldum, gəl bir az oturaq, dincimizi alaq.* Ə.Haqverdiyev. *..Həmişə gəzib yorulanda burada dincimi alırdım.* A.Divanbəyoğlu. *..Ov günündən sonra dincimi almaq, yeyib-içmək arzusundan artıq, Eldardan Göyərçinlə əlaqədar olan sirri dinləmək ümidi ilə dostumla birlikdə eyvana çıxdım.* M.Rzaquluzadə.

2. Sülhsevər, xeyirxah, sakit.

3. Əmin-amanlıq, sülh və dinclik şəraitində keçən. *Dinc inkişaf dövrü. Dinc yarış. – ..Tezliklə dinc əməyimizə qayıda bilərik.* M.İbrahimov. [Nəcmi:] *Bu vaxta kimi əlbir-dilbir, asayişlə yaşayan, həmişə də alın təri ilə halal çörəyini yeyən bu dinc camaatın arasına nə üçün iğtişaş düşsün?* Ə.Əbülhəsən.

**DİNC-DİNMƏZ** bax **dinc** 1-ci mənada. *Dinc-dinməz adam. Qoyunlar çəməndə dinc-dinməz* (z.) *otlayır.*

**DİNCƏLDİCİ** *sif.* Dincəlməyə, rahatlanmağa, sakitləşməyə imkan verən; dincəldən, sakitləşdirən.

**DİNCƏLİŞ** *is.* Dincəlmə, istirahət.

**DİNCƏLMƏ** "Dincəlmək"dən *f.is.*

**DİNCƏLMƏK** *f.* İstirahətlə öz qüvvəsini bərpa etmək, yorğunluğunu almaq, istirahət

etmək, dincini almaq, rahatlanmaq. [Məşədi Mürsəl:] *Buyur, içəri gəl, gəl dincəl, yorulmusan..* T.Ş.Simurq. *Ovdakı yorğunluğun da, dincəlməyin də başqa bir dadı var.* M.Rzaquluzadə. *Ağca xanımın yeriməyə, danışmağa taqəti qalmasa da, xəyalı dincəlirdi.* Mir Cəlal. // İstirahətini bir yerdə keçirmək. *Bu il harada dincəldin? – Yayın isti günlərində; Dincəlmişik gözəl, sərin; Kölgəsində meşələrin.* M.Dilbazi. // Rahat olmaq, sakit olmaq, rahatlanmaq, intizardan, təlaşdan, təşvişdən qurtarmaq. *Oğlundan bir xəbər olmadığı üçün heç dincələ bilmir. – Yar məndən üz döndərdi; Qoy dincəlsin xalq indi.* (Bayatı). *Həsənəli bəy gedəndən sonra Məşədi Əsgərin ürəyi bir az dincəlmişdi.* S.M.Qənizadə. // Sakit olmaq, işinə, hərəkətinə, fəaliyyətinə ara vermək. *Ticarət əzmilə Hində gedərdi; Gecə-gündüz dincəlməyib sürərdi.* Q.Zakir. *Çıraq yanır, mənim yuxum gəlməyir; Vıyıldayır külək də, dincəlməyir.* A.Səhhət. [Səriyyə xala:] *Ağlama oğul, dincəl, gedərik. Başını dizimin üstünə qoy!* M.İbrahimov.

**DİNCƏLMƏZ** *sif.* Dinclik bilməyən, rahatlıq bilməyən, aram bilməyən.

**DİNCƏLTMƏ** "Dincəltmək"dən *f.is.*

**DİNCƏLTMƏK** *f.* 1. Sakit etmək, rahatlandırmaq. *Uşaqları dincəltmək.*

2. İstirahət vermək, dincəlməsinə, yorğunluğunun çıxmasına imkan vermək, şərait yaratmaq. *Atları dincəltmək.*

**DİNCLƏŞDİRİLMƏ** "Dincləşdirilmək"dən *f.is.*

**DİNCLƏŞDİRİLMƏK** *məch.* Dincə qoyulmaq (torpaq).

**DİNCLƏŞDİRMƏ** "Dincləşdirmək"dən *f.is.*

**DİNCLƏŞDİRMƏK** *f.* Dincə qoymaq (torpaq).

**DİNCLƏŞMƏ** "Dincləşmək"dən *f.is.*

**DİNCLƏŞMƏK** *f.* Sakit olmaq, dinc bir vəziyyət almaq.

**DİNCLİK** *is.* 1. Rahatlıq, sakitlik, istirahət. *Mənə alın tərimlə qismət oldu dincliyim.* S.Rüstəm. *Bəli, Şamama dincliyi, rahat oturmağı başqa cürə başa düşən adamdı.* Ə.Əbülhəsən. ◻ **Dinclik bilməmək** – istirahət etməmək, rahatlıq bilməmək, daim çalışmaq, işləmək, fəaliyyətdə olmaq. **Dinclik verməmək** – rahat qoymamaq, daim narahat etmək, dinc qoymamaq. *..Məcid* [Ninaya] *dinclik vermirdi.* M.S.Ordubadi. **Dincliyi tutmamaq** – işsiz, fəaliyyətsiz, hərəkətsiz dura bilməmək, rahatlıq bilməmək.

2. Asayiş, əmin-amanlıq, arxayınlıq; sakit, dinc vəziyyət. *Məmləkətin hüdudlarında dinclik hökm sürməyə başlamışdı.* M.S.Ordubadi.

**DİNÇİ** *is.* Allahın varlığına inanan və mənsub olduğu dinin ehkamlarına ciddi surətdə əməl edən adam; mömin. *Kəndlilər hər şeydən artıq dinçi idilər.* M.S.Ordubadi.

**DİNÇİLİK** *is.* Allaha və dinə inanma, dini ehkamları yerinə yetirmə.

**DİNDAR** [*ər.* din və *fars.* ...dar] b a x **dinçi**. *Dindar adam. – Dindar olanın halı pərişan gərək olsun; Əfsürdə dili, bisərü saman gərək olsun.* Ə.Qəmküsar. *Mehriban dindar, əski bir müsəlman ailəsinin tərbiyə edib yetişdirdiyi bir qızdı.* S.Hüseyn.

**DİNDARCASINA** *zərf* Dindar adam kimi, mömincəsinə.

**DİNDARLIQ** b a x **dinçilik**.

**DİNDAŞ** *is.* Eyni dinə mənsub adamlardan hər biri; başqası ilə bir dində olan (adam). *Sarı Çobanoğlu, gözəl dindaşım; Nə çəkərsən sən dərd-sər, ağlarsan.* M.V.Vidadi. *Görməyirsənmi bu biçarə vətəndaşlarını; Bacı-qardaşlarını, sevgili dindaşlarını?* A.Səhhət. *Pulu ancaq yaraşır çinləyəsən sənduqə; Nə ki xərc eyləyəsən millətə, dindaşə, ətə.* M.Ə.Sabir.

**DİNDAŞLIQ** *is.* Eyni bir dinə mənsub olma.

**DİNDİRİLMƏ** "Dindirilmək"dən *f.is.* *Şahidlərin dindirilməsi.*

**DİNDİRİLMƏK** *məch.* İfadə alınmaq, sorğu-sual edilmək, istintaq edilmək (olunmaq). *Müttəhim dindirilmişdir.*

**DİNDİRİŞ** *is.* Dindirmə, sorğu-sual, istintaq.

**DİNDİRMƏ** "Dindirmək"dən *f.is.*

**DİNDİRMƏK** *f.* 1. Danışdırmaq, söylətmək. *Yarı xəlvətdə gördüm; Dindirmədim doyunca.* (Bayatı). // *məc.* Əzizləmək, oxşamaq. *Yerlərdə süründün, yetişər, göylərə qaldır; Dindir qucağında.* H.Cavid. *Ürkək baxışlarınla ruhumu dindirəydin; Məni sevindirəydin.* M.Müşfiq. // *məc.* Çalmaq, səsləndirmək.

*Sonra kamançanı da birisinə verərək: – Firidun xan, al, bir bunu dindir, görüm, – dedi.* M.S.Ordubadi. [Rübabə] *divardan tarı alıb istəkli kimi bağrına basdı, simləri dindirdi.* Mir Cəlal. // İnkar şəklində: **dindirməmək** – danışdırmamaq, küsülü olmaq. *Çoxdandır bir-birlərini dindirmirlər. – Xatırında varmı, hərdən küsüşüb; Deyərdin: – Danışma, dindirmə məni?* R.Rza.

2. Bir işi aydınlaşdırıb müəyyənləşdirmək üçün danışdırmaq, sorğu-sual etmək, istintaq etmək. *Məhkəmədə bu gün şahidləri dindirəcəklər. – Vahidin özünü də çağırıb müttəhim kimi qapı ağzında xeyli dayandırdılar və sonra dindirdilər.* Mir Cəlal.

**DİNG** *is.* Çəltiyi döyüb dənlərini qabığından çıxarmaq üçün qurğu. *Su dingi. Ayaq dingi. Ding döymək. Dingi işlətmək. Əl dingi* (*həvəngdəstə*). *– Şöhrətim var, işləyir dingim, dəyirmanım mənim.* Ə.Nəzmi.

**DİNGƏ[1]** *is. məh.* 1. Hündür yer.

2. Söhbət, istirahət üçün camaatın toplandığı yer.

**DİNGƏ[2]** *is. məh.* Qadın baş geyimi.

**DİNGİ** *is. bot.* Şitil, qələm.

**DİNİ** *sif.* [*ər.*] Dinlə əlaqədar olan, dinə aid olan. *Dini ayinlər, adətlər. Dini əfsanələr.*

**DİNİB-DANIŞMAQ** 1. B a x **dinmək** 1-ci mənada. *Zınqırovlu faytonda heç kəs dinib-danışmırdı..* S.Rəhimov. [İskəndər] *dinib-danışmırdı.* M.Hüseyn.

2. İnkar şəklində: **dinib-danışmamaq** – susmaq, danışmamaq, heç bir söz deməmək, sükut etmək. *Niyə dinib-danışmırsan? O, bayaqdan susub, dinib-danışmır.*

**DİN-İMAN** *is.* Din, məzhəb, etiqad. *Dini-imanı danıb, yoldan azıbdır, babıdır.* M.Ə.Sabir. *Unutmur Ayişə bir an Osmanı; Bağlıdır Osmana dini-imanı.* H.K.Sanılı. // *məc.* Ən müqəddəs, ən əziz şey haqqında. *Koroğlunun din-imanı; Eyvaz, bu gələndir, gələn.* "Koroğlu".

**DİNİŞ** *is.* Şalban kimi işlədilən qalın taxta.

**DİNMƏK** *f.* 1. Danışmaq, söz söyləmək. *Hə adam istəyir hirsini yesin, dinməsin, insanı özbaşına qoymurlar, dindirirlər.* C.Məmmədquluzadə. *Bala fərəhləndi, ana sevindi; Gah Gülər danışdı, gah Rəna dindi.* M.Rahim.

2. Səslənmək, eşidilmək. *O, indi düşünür həyata dair; Dinir qulağında topların səsi.* S.Vurğun. *Toplarımız dinən zaman sular olur lal.* Ə.Cəmil.

3. Acıqlanmaq, söz demək, kefinə dəymək. *Sənə dinmədikcə, əbləh, azıxıb yolun çaşırsan!* M.Ə.Sabir.

**DİNMƏMƏZLİK** *is.* Dinməmə, danışmama, susma.

**DİNPƏRƏST** *sif.* və *is.* [*ər.* din və *fars.* ...pərəst] *köhn.* b a x **dinçi**.

**DİNPƏRƏSTLİK** b a x **dinçilik**.

**DİNPƏRVƏR** *sif.* [*ər.* din və *fars.* ...pərvər] b a x **dinpərəst**.

**DİNPƏRVƏRLİK** b a x **dinpərəstlik**.

**DİNSİZ** *sif.* və *is.* 1. Heç bir dinə inanmayan; ateist. [Şeyx Sənan:] *Dəlilik başqa bir fəzilətdir; Dinsiz olmaq da bir təriqətdir.* H.Cavid.

2. *məc. zar.* Qəddar, mərhəmətsiz, insafsız adam haqqında. *Dinsizin öhdəsindən imansız gələr.* (Ata. sözü).

**DİNSİZLİK** *is.* Heç bir dinə inanmama, heç bir dinə mənsub olmama, dinləri rədd etmə; ateistlik. *Dinsizlik ilə kəsb olunan bir mədəniyyət; Vəhşiyyətin ən qorxulu səhrası deyilmi?!* M.Ə.Sabir.

**DİPDİRİ** *sif.* 1. Çox diri, çox canlı, diribaş, qıvraq, bütün gücünü özündə saxlamış. *O, qoca olsa da, hələ dipdiridir.*

2. B a x **diri** 2-ci mənada.

**DİPLÓM** [*fr.* əsli *yun.*] 1. Ali və ya xüsusi orta məktəb qurtarmaq, habelə bir ad və ya elmi dərəcə almaq haqqında şəhadətnamə. *Ali məktəb diplomu. Elmlər namizədi diplomu. – Nəriman inşaat mühəndisi diplomunu alan günün sabahı Kərim bəy yaxın yoldaşları ilə əncirli həyatə nişan apardılar.* Mir Cəlal.

2. Universiteti, institutu və s. qurtarmaq haqqında şəhadətnamə ala bilmək üçün yazılan əsər, layihə və s. *Tarixdən diplom işi. – Ayna diplom işini yazır, mən də qəzetə baxırdım.* İ.Əfəndiyev. *Qəhrəman zarafatla dedi: – Sürmə şərt qoyubdur ki, diplomu müdafiə eləməmiş toy olmayacaq.* M.Süleymanov.

3. Bir şəxsə, ya müəssisəyə hər hansı bir hüquq verildiyini təsdiq edən sənəd. *1-ci dərəcəli diplom. Dünya çempionu diplomu.*

**DİPLOMÁNT** *is.* [*fr.*] bax **diplomçu**.

**DİPLOMÁT** [*fr.*] 1. Xarici dövlətlərlə əlaqə saxlamaq və yaxud müzakirələr aparmaq üçün bir dövlət tərəfindən vəkil edilmiş vəzifəli şəxs. *Xarici diplomatlar. Diplomatlar korpusu* (bax **diplomatik** 1-ci mənada).

2. *məc.* Məqsədini gizlədərək məharətlə özünü aparmağı, danışmağı bacaran, tez başa düşən, siyasətçi adam haqqında. *O, çox diplomat adamdır. – Mən sizinlə bir iranlı kimi danışıram, – dedi, – mən diplomat deyiləm, diplomat dili ilə danışanları da sevmərəm.* M.S.Ordubadi.

**DİPLOMATCASINA** *zərf* Ustalıqla, məharətlə; diplomat kimi.

**DİPLOMATÍK** *sif.* [*fr.*] 1. Diplomatiyaya aid olan, diplomatiya ilə əlaqədar olan, diplomatiyaya xidmət edən. *Diplomatik danışıqlar. Diplomatik münasibət. Diplomatik nümayəndəlik* (bir dövlətin başqa xarici ölkədə rəsmi nümayəndəliyini həyata keçirən idarə). *Diplomatik korpus* (bir ölkədə olan xarici diplomatik nümayəndələrin hamısı). *Diplomatik kuryer* (diplomatik poçtu gətiribaparan vəzifəli şəxs).

2. *məc.* Çox incə düzəldilmiş, ustalıqla qurulmuş; diplomata (2-ci mənada) xas olan. *Diplomatik cavab. – İsmayılzadə təbiətən diplomatik hiylələrə yad bir adamdır.* M.Hüseyn.

**DİPLOMÁTİYA** *is.* [*fr.*] 1. Hökumətin öz xarici, beynəlxalq siyasətini həyata keçirmək sahəsində apardığı iş, fəaliyyət.. *Lakin Qafqazın cəlb etmək xasiyyəti məhz bir diplomatiya məsələsidir.* C.Məmmədquluzadə.

2. *məc.* Hər hansı bir məqsədə doğru yönəldilmiş hərəkət və danışıqlarda incəlik, hiyləgərlik, çeviklik bacarığı.

**DİPLOMATLIQ** *is.* 1. Diplomatın işi, vəzifəsi.

2. *məc.* Hərəkətdə və danışıqda incəlik, ustalıq, elastiklik, hiyləgərlik.

**DİPLOMÇU** *is.* Diplom işi yazan tələbə.

**DİPLOMLU** *sif.* Diplomu olan, diplom almış. *Diplomlu texnik. Diplomlu müəllim. Diplomlu aqronom.*

**DİPLOMSUZ** *sif.* Diplomu olmayan. *Diplomsuz mühəndis.*

**DİRABİ: dirabi papaq** *köhn.* – drapdan tikilmiş kişi papağı. *Hərəsi başına qara rəngli bir dirabi papaq qoydu..* "Kirpi".

**DİRÇƏLDİLMƏ** "Dirçəldilmək"dən *f.is.*

**DİRÇƏLDİLMƏK** *məch.* 1. Əvvəlki vəziyyətinə nisbətən daha sağlam hala gətirilmək; sağlamlaşdırılmaq.

2. Təzədən meydana gətirilmək, təzədən fəaliyyətə gətirilmək; canlandırılmaq.

**DİRÇƏLƏNMƏK** *dan.* bax **dirçəlmək**. *Ot, ağac dirçələnir, hər birisi canə gəlir.* R.Əfəndiyev.

**DİRÇƏLİŞ** *is.* Dirçəlmə, canlanma, inkişaf etmə; inkişaf prosesi. *Dirçəliş dövrü.*

**DİRÇƏLMƏ** 1. "Dirçəlmək"dən *f.is. Cuma özündə bir dirçəlmə .. hiss etmişdi.* Ə.Əbülhəsən.

2. Bax **dirçəliş**.

**DİRÇƏLMƏK** *f.* 1. Əvvəlki vəziyyətinə nisbətən yaxşılaşmaq, yavaş-yavaş qüvvəti özünə qayıtmaq, bərkimək, sağlamlaşmaq, özünü əvvəlkinə nisbətən daha yaxşı hiss etmək. *Xəstə dirçəlir. – Uşaq böyümüş, rəngi açılmış, dirçəlmiş, çevikləşmişdi.* Mir Cəlal.

2. *məc.* Canlanmaq, cana gəlmək, yavaş-yavaş qüvvətlənmək. *Ağaclar dirçələndə; O məktəbli uşaqlar; Çıxmışdı dağ döşünə.* M.Rahim. *..Torpaq yenicə dirçəlməyə başladı.* Ə.Məmmədxanlı.

3. *məc.* Böyümək, inkişaf etmək.

**DİRÇƏLTMƏ** "Dirçəltmək"dən *f.is.*

**DİRÇƏLTMƏK** *f.* Dirçəlməsinə kömək etmək, dirçəlməsinə səbəb olmaq; yenidən canlandırmaq, yenidən bərpa etmək; qüvvətləndirmək, sağlamlatmaq. *Həkimlər xəstəni dirçəltdilər. – Torpaq günəşi çəkərək buğlanır, qoynundakı körpə bitkiləri bəsləyərək dirçəldirdi.* M.İbrahimov.

**DİR-DİRRİK** *top.* bax **dirrik**[2].

**DİRÉKSİYA** [*lat.*] *xüs.* Bir idarənin, müəssisənin, məktəbin, başda direktor olmaq üzrə, rəhbərlik edən yüksək orqanı; müdiriyyət. *İnstitutun direksiyası. Teatrın direksiyası. Direksiyanın sərəncamı.*

**DİREKTÍV** [*fr.*] 1. *is.* Bir işi yerinə yetirmək üçün ali orqan tərəfindən aşağı orqanlara verilən göstəriş, əmr, təlimat və s. *Partiya qurultayının direktivləri. Direktivə əməl etmək.*

2. *sif.* Əmr, təlimat, göstəriş mahiyyətində olan. *Direktiv göstərişlər. Direktiv məktub.*

**DİRÉKTOR** *is.* [*lat.*] Müəssisə, idarə, yaxud məktəb müdiri. *Zavod direktoru. Teatr direktoru. – Dərs hissə müdirinin, məktəb direktorunun kabinetlərində dayanmadan iş gedirdi.* S.Rəhimov.

**DİREKTORÁT** [*lat.*] bax **direktorluq** 2-ci mənada.

**DİREKTÓRİYA** [*fr.*] Bəzi hökumətlərin, məsələn, Fransada Fransa inqilabı vaxtındakı (1795-1799) hökumətin adı.

**DİREKTORLUQ** *is.* 1. Direktor vəzifəsi, direktorun fəaliyyəti. *Direktorluq etmək. Direktorluq vəzifəsi.*

2. Bax **direksiya**. *Bu işi direktorluq həll etməlidir. Məsələni direktorluğun müzakirəsinə vermək.*

**DİREKTRÍSA** [*fr.*] *riyaz.* Analitik həndəsədə: konus kəsiyi əyrilərinin oxuna şaquli olan ikinci tərtibli əyri.

**DİRƏ: dirə çəkmək (tutmaq)** – əzab vermək, divan tutmaq. *O məhkum insana tutulan dirə; Özün görürsən ki, bir faciədir.* S.Vurğun.

**DİRƏDÖYMƏ** *is.* Kütləvi uşaq oyunlarından birinin adı. [Nəsib] *daha dirədöymə oynamaqdan yorulmurdu.* S.Rəhimov. *..Dirədöymə oynayan cavan uşaqlar Veysi görəndə nə isə qorxu qarışıq hörmətlə dayanıb durdular.* Ə.Əbülhəsən.

**DİRƏXŞAN** *sif.* [*fars.*] *klas.* Parlayan, işıq saçan, parlaq. *Verib ayinə kimi arizi-zibayə səfa; Hüsnü gör, şövkətə bax, mehri-dirəxşan gəldi.* Ə.Nəbati. ◻ **Dirəxşan olmaq** – parlamaq, nurlanmaq. *Bayaq onun qəm və qüssə bilməyən və həmişə Cəlilin məhəbbətinə dirəxşan olan könlü və ürəyi indi qan ağlayırdı.* İ.Musabəyov.

**DİRƏK** *is.* 1. Bir şeyi saxlamaq üçün altına vurulan tir, sütun, dayaq. *Ağac dirək. Daş dirək. – Şirəli daxmanın dirəyinə qısıldı.* M.Hüseyn. *Eyvanın dirəyindən asılmış kiçik bir kisədən bir ovuc dən götürüb həyətə səpdi.* M.Rzaquluzadə. // Elektrik, telefon məftillərini asmaq üçün dikinə basdırılmış dəmir, beton, ya ağac sütun. *Yollar boyu uzanmışdır elektrik dirəkləri...* M.Rahim. *İş məntəqəsinin müxtəlif yerlərində dirəklərə vurulmuş radio cihazları dillənib partlayışların harada olacağını xəbər verdi.* Ə.Sadıq. // Doraǧacı. *Batumi limanında duran gəmilərin dirəkləri uzaqdan kiçik qutulara taxılmış kibrit çöpü kimi görünürdü.* M.S.Ordubadi.

2. *məc.* Arxa, kömək, daldanacaq mənasında. *Böyük oğul ailənin dirəyidir. – Aqil kişi durbin gərəkdir; Dünyada ümid bir dirəkdir.* Füzuli. *Qıratdı mənim dirəyim.* "Koroğlu". *Şair deyər mahnısında: "Ellər bizim anamızdır; Evimizin ellər adlı bir yıxılmaz dirəyi var".* S.Vurğun. ◻ **Dirək olmaq** – arxa durmaq, kömək etmək. *De gəl yoxsullara olgilən dirək; Yetimli dullara vergilən çörək.* H.K.Sanılı.

◊ **Dirəyi qızıldan olmaq** – çox varlı, zəngin, dövlətli adam haqqında. **Dirək kimi** – çox uzun adam haqqında. *Surxay dirək kimi dimdik durur, tərpənməyirdi.* M.Hüseyn.

**DİRƏKCƏ** *is.* Kiçik dirək, dirəkcik.

**DİRƏKCƏLİ** *sif.* Dirəkcəsi olan. *O addımlayıb nazik dirəkcəli eyvanda dayandı.* S.Rəhimov.

**DİRƏKCİK** *is.* Kiçik dirək, qısa dirək, nazik dirək.

**DİRƏKLƏMƏ** "Dirəkləmək"dən *f.is.*

**DİRƏKLƏMƏK** *f.* Dirək vurmaq, dirək salmaq, dayaq vurmaq, dirəklə bərkitmək, dirəklə saxlamaq.

**DİRƏKLƏNMƏ** "Dirəklənmək"dən *f.is.*

**DİRƏKLƏNMƏK** *f.* 1. *məch.* Dirək salınmaq, dirək vurulmaq, dayaq vurulmaq, dirəklə bərkidilmək.

2. Dirək kimi qalxmaq, ucalmaq, yüksəlmək. *Neft quyularının hamısından alov göyə dirəklənəcək və günahkarları bir-bir təpəsi üstündə quyulara salacaqlar.* Ə.Haqverdiyev. *Gördü dirəklənib göyə toz, qara tüstü çox qəliz.* Ə.Nəzmi. *Qara və qorxunc tüstü burum-burum göyə dirəkləndi.* Ə.Vəliyev.

**DİRƏKLƏTMƏ** "Dirəklətmək"dən *f.is.*

**DİRƏKLƏTMƏK** *icb.* Dirək vurdurmaq, dirək saldırmaq.

**DİRƏKLİ** *sif.* Dirəyi, yaxud dirəkləri olan, dirək salınmış, dirək vurulmuş. *Dirəkli çadır. Dirəkli dam. Dirəkli divar.*

**DİRƏKLİK** *sif.* Dirək üçün yararlı. *Dirəklik ağac.*

**DİRƏKSİZ** *sif.* Dirəyi olmayan, dirəklə bərkidilməmiş. *Dirəksiz çadır. Dirəksiz ev.*

**DİRƏMƏ** "Dirəmək"dən *f.is.*

**DİRƏMƏK** *f.* 1. Dayamaq, söykəmək. [Xədicə] *əllərini yerə dirədi, qalxıb oturmaq istəyirdi.* S.Hüseyn. [Fərhad] *əvvəlcə sağ əlinə söykənib güclə qalxdı, sol əlini də yerə dirədi.* Ə.Vəliyev. *Leyla alnını pəncərə şüşəsinə dirədi.* Ə.Məmmədxanlı.

2. Zilləmək, diqqətlə baxmaq (bu mənada adətən "gözünü", "gözlərini" sözü ilə). [Xudayar bəy] *..gözünü evin səqfinə dirəyib, deyəsən, pərdi sayırdı.* C.Məmmədquluzadə.

3. *məc.* İrəli vermək, sinə gərmək, sipər etmək. *Rüstəm kişi sinəsini bu adsız, lakin açıq zərbələrin qabağına dirəyib, iki dəfə özündən çıxır.* M.İbrahimov.

◊ **Ayağını yerə dirəmək** – b a x **ayaq dirəmək** (**"ayaq[1]"**da). [Qulu:] *Yox, fələk də ayağını yerə dirəsə, mən bu yeri satmayacağam.* A.Şaiq. **Divara dirəmək** – b a x **divar**. **İki ayağını bir başmağa dirəmək** – b a x **ayaq[1]**.

**DİRƏNMƏ** "Dirənmək"dən *f.is.*

**DİRƏNMƏK** *f.* 1. Söykənmək, dayanmaq. *Dirənmiş çomağa, Osman dururdu; Ürəyi nehrətək gup-gup vururdu.* H.K.Sanılı.

2. Gəlib dəymək, uzanıb bir yerə (şeyə) toxunmaq, təmas etmək, rastlaşmaq. *Şəhərin bir ucu yola dirənirdi. – Seyrəngahın bir tərəfi qayaya dirənmişdi.* S.S.Axundov. // *məc.* Bir maneəyə rast gəlmək.

3. Dik qoyulmaq (sancılmaq). *Bellər yerə dirəndi.* Ə.Vəliyev. // Dik durmaq.

4. Dikilmək (bu mənada adətən "gözü", "gözləri" sözü ilə). *Səməd xan düyüdən bir loğma yeyərək durmuşdu, onun nimçəyə dirənən gözü yol çəkirdi.* M.S.Ordubadi. *Qoca qarı üzünü yola-yola gəlib qabağımda dayanıb, dirənmiş lap gözümün içinə baxdı, sonra dedi..* A.Divanbəyoğlu. *Gözlər qır rəngli torpağa dirənir.* M.İbrahimov.

5. *məc.* Üstündə durmaq, israr etmək, ciddiyyətlə tələb etmək, inad etmək. *Əgər müdir dirənsə və vermək istəməsə, onda sən də de ki, gedib anbarın hər yerini axtaracağam.* C.Məmmədquluzadə.

6. Qalxmaq, qalxmağa başlamaq. [Xacə Firuz:] *Camaat həmişə azar və əziyyətdə, ahü-nalə və nifrin göyə dirənibdir.* Ə.Haqverdiyev. *Onlar atlarını tərpədib yoxuşa dirəndilər.* S.Rəhimov.

**DİRƏŞMƏ** "Dirəşmək"dən *f.is.*

**DİRƏŞMƏK** *f. dan.* Gözlərini dirəmək, dirənib baxmaq (bir çoxları). *Üzünə dirəşmək.*

**DİRHƏM** *is.* [*ər.*] 1. 3,12 qrama bərabər çəki ölçüsü.

2. Bəzi ərəb ölkələrində gümüş pul vahidi. *Hər nə versən, ver, məbadə vermə bir dirhəm zəkat.* M.Ə.Sabir. *Üç min dirhəm o qədər də böyük bir pul deyil..* M.S.Ordubadi.

**DİRİ** *sif.* 1. Canı olan, canlı, sağ, yaşayan (*ölü* ziddi). *Diridir, ölməmiş Simon hala; Ona fürsət verərmiyim?* H.Cavid. // Öldürülməmiş, başı kəsilməmiş, canı çıxmamış. *Diri quş. Diri balıq.* – [Quşu] *diri* (z.) *saxlamaq niyyəti ilə üsulluca çantaya salıb Eldarın yanına qayıtdı.* M.Rzaquluzadə. □ **Diri etmək** – diriltmək, yaşatmaq, əbədiləşdirmək. *Təəccüb budur ki, mərhum Molla Vəli Vidadinin .. asar və əşarından və tərcümeyi-halından bixəbərdirlər və onun adını diri etməyə əsla hümmət və qeyrət göstərməyirlər.* F.Köçərli. // İs. mənasında. *Ölülər elə bilirlər ki, dirilər halva yeyir.* (Ata. sözü). *Demək olmaz dirilərtək yatıb, əlbət, duracaq; Ölülər yatmağıdır, yox buna payan, ölüb... ə!* M.Ə.Sabir. **Diri qalmaq** – yaşamaq, ölməmək, var olmaq. *Farsların Sədi və Hafizi diri qalan kimi, bizlərin də Zakiri, Seyyidi, Nəbatisi, Saliki, Arifi gərək diri qalsınlar.* F.Köçərli.

2. Yaxşı bişməmiş; çiy. *Xörəyin düyüsü diridir.*

3. Sərt, cod. *Diri parça.*

4. *məc.* Qüvvətli, çevik, qıvraq, diribaş, əlli-ayaqlı, bacarıqlı. *Diri adam. Diri qocadır.* // Canlı, qüvvətli. *Safonun baldırı min dəfə səninkindən diridir.* S.Rəhimov. // Canlı, ifadəli. *Uşağın iri və diri gözləri muncuq kimi parıldadı.* Mir Cəlal.

**DİRİBAŞ** *sif.* Cəld, çevik, zirək, bacarıqlı. [İskəndər bəy:] *Xala, sən nə diribaş qarısan?* N.Vəzirov. [Qəhrəman:] *Yoldaşlarımın biri nazik, arıq, alagözlü, .. qarasaçlı, diribaş bir qız idi.* H.Nəzərli. *Laçın hələ yeddicə yaşında ikən, çox diribaş, çevik, əlli-ayaqlı bir uşaqdı.* M.Hüseyn. *Dərsdən sonra bir*

*dəstə özü kimi diribaş uşağı başına yığırdı.* M.Rzaquluzadə.

**DİRİBAŞLAŞMA** "Diribaşlaşmaq"dan *f.is.*

**DİRİBAŞLAŞMAQ** *f.* Diribaş olmaq, diribaşlığı daha da artmaq; çevikləşmək, zirəkləşmək.

**DİRİBAŞLI** bax **diribaş**.

**DİRİBAŞLIQ** *is.* Cəldlik, çeviklik, zirəklik, bacarıqlılıq. *Zeynəb xanım .. cavankən diribaşlığı və müdrikliyi ilə ata-anasının heyrətinə səbəb olardı.* Çəmənzəminli. *Cəlilzadənin .. Saranın diribaşlığından xoşu gəlirdi.* S.Rəhimov.

**DİRİCƏ** "Diri"dən *oxş.*

**DİRİ-DİRİ** *zərf* 1. Diri halda, öldürmədən, ölməmiş. *Quşu diri-diri tutmaq. – Amma razı olduqda özümü diri-diri od içinə salmış olurdum.* T.Ş.Simurq. [Birinci kəndli:] *Ay Mirzə, başına dönüm, .. Səfər bəy bizi diri-diri qırıb tələf edir..* B.Talıblı. *Dini fanatizm nə qədər insan qüvvəsini boğub öldürmüş, diri-diri çürütmüşdür.* M.İbrahimov.

2. Lazımınca çeynəmədən. *Diri-diri udmaq.*

**DİRİGÖZLÜ** *sif.* 1. Canlı, diri. [Əsgər:] *Mən arşını iki şahılıq çiti görməmiş almayıram; Halbuki dirigözlü arvad ola!* Ü.Hacıbəyov.

2. İtigörən, zirək. *Bu uşaqlar dirigözlü, təpədən-dırnağa qədər silahlanmış düşmənlə vuruşurdular..* M.Rzaquluzadə.

3. *zərf* Diri-diri, diri halda. *Onlar aralığa salıb Alıxan ağanı dirigözlü tutdular.* S.Rəhimov.

**DİRİJÁBL** [*fr.*] İçərisi qazla doldurulmuş korpusu olan, xüsusi mühərrikli, havadan yüngül, uçucu aparat; idarə olunan aerostat.

**DİRİJÓR** [*fr.*] Orkestri, xoru, opera, ya balet tamaşasını idarə edən şəxs. *Balet dirijoru. Orkestr dirijoru. – Səbri dirijor çubuğunu yuxarı qaldırarkən salon kiridi, alqış dərin və mənalı bir sükuta çevrildi.* M.Hüseyn. *Davud əllərini kənara açıb, dirijor kimi işarə verəndə oturanların hamısı dilləndi.* Mir Cəlal.

**DİRİJORLUQ** *is.* Dirijorun işi, sənəti, vəzifəsi. *Dirijorluq etmək* (orkestri, xoru idarə etmək).

**DİRİLDİCİ** *sif.* Dirildən, can verən, ruh verən, həyat verən.

**DİRİLİK** *is.* 1. Diri, canlı cismin halı, diri halda olma; sağlıq. *Ölü öldü, diriyə dirilik gərək.* (Ata. sözü). // Varlıq, mövcudluq, var olma, mövcud olma. [Qədir:] *Mən yekəlikdə adamın diriliyini danırlar.* Mir Cəlal.

2. Həyat, yaşayış, güzəran. [Səfdərqulu:] *..Allah kəssin belə diriliyi, belə günü!* N.Vəzirov. *Şəhərin gurultulu yaşayışından sonra kəndə məxsus asudə, səssiz bir diriliyə adət eləmədiyimdən bir növ darıxırdım.* T.Ş.Simurq. ☐ **Dirilik etmək** – yaşamaq, həyat sürmək. *Əziz balalar!.. Bütün mikroblar havada, yerdə və suda dirilik edirlər.* N.Nərimanov. **Dirilik suyu (çeşməsi, bulağı)** *şair.* – bax **abi-həyat** (**"ab"**da). *Dirilik suyu harda idi ki, Xızr içəydi, diri qalaydı.* M.F.Axundzadə. *Sənin gözlərinmi gənclik bağında; Yoxsa nərgizlərin sayrışıb oynar; Yoxsa çıxılmayan eşqin dağında; Ömrünün dirilik çeşməsi oynar.* M.Müşfiq. *Gözəl həyat, gözəl günə; Taleyini qurtarana Xızır dedi; Çox aradı diriliyin bulağını.* R.Rza. **Dirilik vermək** – həyat vermək, ruh vermək, yaşatmaq, can vermək. *Hər bir şeyə dirilik və zinət verən məhəbbətdir.* F.Köçərli.

3. *məc.* Var-yox, həyat mənbəyi. *Onun diriliyi yalnız iki öküz və bir parça əkin yerindən ibarət olduğundan o, rəncbərlik etməyə məcbur olurdu.* A.Şaiq.

4. *məc.* Canlılıq, coşqunluq, həyat əlaməti. *Budəfəki səsində bir dirilik, bir ümid əsəri vardı.* A.Şaiq. *Mən bu qadını bir az tanıyırdım. ..Yanaqlarında .. bir qırmızılıq, gözlərində bir dirilik mövcud idi.* S.Hüseyn.

5. Sərtlik, codluq. *Düyünün diriliyi.*

**DİRİLMƏ** "Dirilmək"dən *f.is.*

**DİRİLMƏK** *f.* 1. Canlanmaq, cana gəlmək, dirçəlmək; qüvvəsi, gücü, cəsarəti özünə qayıtmaq. *Bənnasız hörgü hörülməz; Təbibsiz xəstə dirilməz.* "Koroğlu". *Məstan bəy dirildi. Papağını qaşının üstə çəkib bığlarını tumarladı..* B.Talıblı.

2. Dini təsəvvürlərdə: ölü halından canlı – diri hala gəlmək, yenidən canlı olmaq, canı özünə qayıtmaq. *Ölü dirilməz. – Amma budu zənnim ki, dirilsə Loğman; Hərgiz edə bilməz*

*qəmi-hicranə ilac.* S.Ə.Şirvani. [İblis:] *İsa dirilib gəlsə də, qorxar qəzəbimdən.* H.Cavid.

**DİRİLTMƏ** "Diriltmək"dən *f.is.*

**DİRİLTMƏK** *f.* 1. Canlandırmaq, həyata qaytarmaq, yenidən enerji və qüvvət vermək, ruhlandırmaq. *Orqanizmi diriltmək. Bu su məni diriltdi. Dağ havası xəstəni diriltdi.* – [Həcər xanım:] *Oğlum, Çingiz, mənə yenidən ruh verib diriltdin, Allah səni hər bəladan hifz etsin.* S.S.Axundov.

2. Dini-mistik təsəvvürlərdə: ölü halından canlı – diri hala gətirmək, can vermək. *Badisəba İsa kibi gərçi dirildir ölüyi; Ənbərfişan zülfün dəmi badi-səbayə tən edər.* Nəsimi. [Nazlı:] *Ana, deyirlər, bu gələn qonağımız ölüləri dirildir.* C.Məmmədquluzadə.

3. *məc.* Göz qabağına gətirmək, göz önündə canlandırmaq. *Şerim, bu hikməti aləmə bildir; Xəyal ölənləri bəzən dirildir.* M.Rahim. // *məc.* Unudulmuş, xatirədən silinmiş, tərk edilmiş bir şeyi yenidən bərpa etmək; dirçəltmək.

**DİRİNGƏ** *is.* 1. B a x **diringi**. *Arabir diringə* (*oyun havası*) *çalanda mütrüb oynamağa başlardı.* H.Sarabski. [Nazlı] *elə bil, çalğısız, diringəsiz də olsa, bu dəqiqə hökmən oynamaq istəyirdi.* Ə.Əbülhəsən.

2. Uşaqları, ilk ayaq açarkən yeriməyə alışdıran arabacıq; yüyürək.

**DİRİNGİ** *is. mus.* Muğamat hissələri arasında çalınan yüngül və oynaq musiqi parçaları. *Azərbaycan xalq musiqisi ölçülərindən ən çox inkişaf edən, sazəndələr arasında "üç badam bir qoz" deyilən vəzn əsasında olan diringilərdir.* Ə.Bədəlbəyli. // Ümumiyyətlə, oynamaq üçün çalınan yüngül hava. *Diringi çalmaq.*

**DİRİSOYAN** *is. dan.* Amansız, rəhmsiz, insafsız. // Həddindən artıq tamahkar adam haqqında.

**DİRRİK**[1] *is.* Səbzəvat, göyərti və s. əkilən yer; bostan. *Dirrik bitkiləri. – Bəzi adamlar da öz dirrik yerlərində çalışırdı.* S.Rəhimov. *..Bayram bəzən işə getmirdi. Öz həyətinin çəpərini möhkəmləndirir, ağaclarına qulluq edir, suyu öz həyətinə gətirib dirriyini, ağaclarını suvarırdı.* Ə.Vəliyev.

**DİRRİK**[2] *is. dan.* Ev müxəlləfatı, ev şeyləri.

**DİRRİKÇİ** *is.* Dirrikçiliklə məşğul olan adam; bostançı. *Dirriklərdə dizinəcən çirməkli dirrikçilər lək sulayırdılar.* Mir Cəlal.

**DİRRİKÇİLİK** *is.* Dirrikçinin işi, peşəsi, məşğuliyyəti; dirrik becərmə işi; bostançılıq.

**DİRSƏK** *is.* 1. Qol ilə bilək arasında olan büküyün bayır hissəsi. *Bəzən Dilşad xanım üzüqoylu uzanıb, dirsəklərini yerə qoyaraq çayı nəlbəki ilə içər və ayaqlarını part-part yerə döyərdi.* T.Ş.Simurq. *Diyar kişi dirsəyi ilə arvadına toxunub pıçıldadı..* Ə.Məmmədxanlı.

2. İki və daha çox hissədən ibarət olan bir şeyin bucaq şəklində birləşən çıxıntısı, uzun bir şeyin əyilərək təşkil etdiyi bucaqşəkilli bükük, bucaq guşə.

3. Aşağı əyilən, yıxılan bir şeyin altına vurulan paya, dəstək, ağac və s.; dayaq.

◊ **Dirsək göstərmək** – üz döndərmək, dal çevirmək. [Eşikağası:] *Ömər xan kimi bir dilavər* [Fətəli xana] *qılıq eləyir, amma axmaq Məmmədhəsən dirsək göstərirdi.* Çəmənzəminli.

**DİRSƏKCİK** *is.* Kiçik dirsək.

**DİRSƏKLƏMƏ** "Dirsəkləmək"dən *f.is.*

**DİRSƏKLƏMƏK** *f.* 1. Dirsəyi ilə yavaşca vurmaq, itələmək; dirsəyini toxunduraraq bir şey bildirmək. *Yanında oturanı dirsəkləyib oyatdı.*

2. Dirsəyindən tutmaq.

**DİRSƏKLƏNMƏK** 1. *məch.* Dirsəklə yavaşca vurulmaq.

2. *qayıd.* Dirsəyi ilə söykənmək. *Dirsəkləndi, başını qoydu və yatdı. – Dirsəkləndi yerində; Göz gəzdirdi otağa.* R.Rza. *Kiçikxanım pəncərəyə dirsəklənib çənəsini ovcuna almış, həyətə baxırdı.* Mir Cəlal. *Yasavulbaşının altındakı döşək, dirsəkləndiyi balış və mütəkkələr yumşaq quzu yunundan, zərif qu tükündən idisə də, o yenə dincələ bilmirdi.* M.Rzaquluzadə.

**DİRSƏKLİ** *sif.* 1. Dirsəyi olan, yaxud dirsəklər şəklində olan (b a x **dirsək** 2 və 3-cü mənalarda). *Dirsəkli val, boru.*

2. *məc. dan.* Qüvvətli, qolugüclü, sözükeçən. *Dirsəkli adam.*

**DİRSƏKŞƏKİLLİ** b a x **dirsəkvari**.

**DİRSƏKVARİ** *sif.* Dirsəyə oxşayan, dirsək şəklində olan, dirsək kimi bükük olan.

**DİSHARMONÍK** *sif.* Harmoniyasız, ahəngsiz.

**DİSHARMÓNİYA** [*yun.*] *mus.* Harmoniyanın pozulması; ahəngsizlik.

**DİSK** [*yun.*] 1. Yastı, dairəvi lövhə. // *idm.* Uzağa atmaq üçün həmin şəkildə olan idman aləti. *Disk tullama yarışı.* // Maşının və s. qurğunun yastı, dairə, halqa şəklində olan hissəsi. *Telefonun diski. – Qazıma turbininin diskləri poladdan, ya döyülən çuqundan tökmə üsulu ilə hazırlanır.* S.Quliyev.

2. *astr.* Günəşin, Ayın, planetlərin Yerdən görünən dairəvi çevrəsi. *Ancaq vaxtaşırı Ay diskinin gah şərq, gah qərb, gah şimal, gah da cənub kənarlarında əks yarımkürədən ensiz zonalar müşahidə etmək olur.*

**DİSKÁNT** [*lat.*] *mus.* Zil uşaq səsi. // Bu cür səsi olan oxuyan uşaq.

**DİSKET** *is. tex.* Kompyuterdə yazım diski.

**DİSKLƏMƏ** "Diskləmək"dən *f.is.*

**DİSKLƏMƏK** *f. k.t.* Torpağı diskli mala, kultivator və s. ilə becərmək.

**DİSKLƏNMƏ** "Disklənmək"dən *f.is.*

**DİSKLƏNMƏK** *məch. k.t.* Diskli mala, kultivator və s. ilə becərilmək (torpaq).

**DİSKLİ** *sif.* Diski olan. *Diskli mala. Diskli alət.*

**DİSKÚSSİYA** [*lat.*] Hər hansı bir mübahisəli məsələnin iclasda, mətbuatda və s. də azad, açıq müzakirəsi. *Diskussiya keçirmək. Ədəbiyyat məsələsinə həsr olunmuş diskussiya. – Diskussiyada yazıçılar, ədəbiyyatşünaslar, tənqidçilər, alimlər iştirak etmişlər.*

**DİSPANSÉR** [*fr.*] Xüsusi müalicə və müntəzəm tibbi nəzarət yolu ilə xəstəliklərin qabağını almaqla məşğul olan tibbi müəssisə. *Vərəm dispanseri.*

**DİSPANSERİZÁSİYA** [*fr.*] bax **dispanserləşdirmə**.

**DİSPANSERLƏŞDİRMƏ** *f.is. tib.* Dispanserlər vasitəsilə nəzarət və tibbi-profilaktik yardım sahəsində görülən tədbirlər sistemi.

**DİSPÉTÇER** [*ing.*] *xüs.* Nəqliyyatın hərəkətini, yaxud müəssisənin işinin gedişini bir mərkəzi məntəqədən idarə edən işçi. *Dəmiryol stansiyası dispetçeri. Baş dispetçer.*

**DİSPETÇERLİK** *is.* Dispetçerin işi, vəzifəsi. *Dispetçerlik etmək.*

**DİSPLEY** *is.* [*ing.*] Kineskoplu qurğu, cihaz.

**DÍSPUT** *is.* [*lat.*] Elmi, ədəbi və s. mövzuya dair açıq mübahisə. *Ədəbi disput. Tamaşadan sonra əsər haqqında disput keçirildi.*

**DİSPUTÇU** *is.* Disputda iştirak edən adam, disput iştirakçısı.

**DİSSERTÁNT** [*lat.*] Müdafiəyə dissertasiya hazırlayan və ya dissertasiya müdafiə edən şəxs.

**DİSSERTÁSİYA** [*lat.*] Elmi dərəcə almaq üçün təqdim edilən elmi tədqiqat əsəri. *Dissertasiya üzərində işləmək.* – [Sədəf:] *Professor, gözünüz aydın, daha bir sürpriz. Şeyda dissertasiyasında bizə balta çalır.* Ə.Məmmədxanlı.

**DİSSİDENT** *is.* [*lat.*] Başqa cür düşünən, başqa fikirli.

**DİSSİMİLYÁSİYA** [*lat.*] 1. Oxşarlığı, bənzərliyi pozan dəyişiklik.

2. *biol.* Orqanizmin fəaliyyəti prosesində mürəkkəb üzvi maddələrin dağılması, pozulması, parçalanması. *Orqanizmdə canlı maddələrin yaranması* (*toplanması*) *ilə əlaqədar olaraq, hüceyrələrin və canlı maddələrin parçalanması prosesi də gedir ki, buna da dissimilyasiya deyilir.* "Qaramal".

3. *dilç.* Ardıcıl gələn eyni səslərdən birinin başqa səslə əvəz olunması (məs.: "zərər" əvəzinə "zərəl").

**DİSSONÁNS** [*fr.*] *mus.* Səslərdə ahəngsizlik, qarışıqlıq, uyğunsuzluq; ahəng pozğunluğu. [Gülsabah:] *Çığırmaq lazım deyil, yoldaş Mirzə Camal... Çığırırsınız, tondan çıxarırsınız, dissonans əmələ gəlir.* C.Cabbarlı.

**DİSTÁNSİYA** [*lat.*] 1. Məsafə, ara, mənzil.

2. Dəmir yolunda, şose və su yolunda inzibati-texniki bölgü məntəqəsi. *Yol distansiyası.*

**DİSTİLLÁT** [*lat.*] *kim.* Distillə nəticəsində alınan maye. *Buxarlanma və ya qaynama prosesində əmələ gələn buxarları ayırıb mayeləşdirirlər. Bu prosesə distillə, alınmış mayeyə isə distillat deyilir.* M.Məmmədli.

**DİSTİLLÁTOR** [*lat.*] *xüs.* Mayeləri distillə edən cihaz; ənbiq.

**DİSTİLLƏ** [*lat.*] *xüs.* Mayeləri qaynadaraq əsas tərkib hissələrinə ayırmaqla təmizləmə, saflaşdırma; təqtir. *Suyu distillə et-*

*mək. – Hərgah maye bərk maddənin məhsulu şəklindədirsə, onu ayırmaq üçün distillə üsulundan istifadə edirlər.* M.Mövsümzadə. *..Süzgəc kağızını bükdükdən sonra onu qıfa kip yerləşdirib distillə edilmiş su ilə isladırlar.* H.Şaxtaxtinski.

**DİSTROFİYA** *is.* [*lat.*] Maddələr mübadiləsi ilə əlaqədar olaraq, orqanizmin qidalanma pozğunluğu.

**DİŞ** *is.* 1. Yeyilən şeyi tutmaq, dişləmək, xırdalamaq və çeynəmək üçün ağızda olan sümük törəmə. *Uşağın dişi çıxır. Dişi ağrımaq. Dişi ilə tutmaq. Dişi ilə qoparmaq. Dişi qamaşmaq. Dişlərini xırçıldatmaq.* □ **Ağıl dişi** – iyirmi yaşdan sonra çıxan axırıncı böyük diş. **Dişi doldurmaq** – dişi plomblamaq, dişə plomb qoymaq. **Kəsən dişlər** – ağzın qabaq tərəfində olub, yeyilən şeyi kəsib doğramaq vəzifəsini görən dişlər. **Köpək dişlər** – ağzın yan tərəfində olan dişlər. **Qabaq dişlər** – b a x **ön dişlər**. **Ön dişlər** – b a x **kəsən dişlər**. *Əllisində əlif qəddin çəkilər; Altmışında ön dişlərin tökülər.* "Koroğlu". **Süd dişi** – uşağın ağzında çıxan və altı yaşdan sonra tökülüb daimi dişlərlə əvəz olunan birinci dişlər. *Qaraca dədə isə başını aşağı salıb səssizcə gülürdü və qocanın gülüşü süd dişləri təzəcə tökülməyə başlamış bir uşaq gülüşünü andırırdı.* Ə.Məmmədxanlı. **Süni diş, taxma diş** – sonradan qayrılma diş, qoyma diş. **Yan dişlər** – b a x **köpək dişlər**.

2. Müxtəlif alətlərin, maşın hissələrinin, çarxların kənarlarında, üstündə, yaxud uc tərəfində olan ucuiti çıxıntı və ya dilik-dilik hissələrdən hər biri. *Mişarın dişləri. Saat çarxının dişləri. Darağın dişləri.*

3. Bəzi meyvələrin dilim şəklində olan hissələrindən hər biri. *Bir diş sarımsaq.*

4. Meyvənin hər dəfəsində dişlə qoparılan hissəsi. *Bir diş alma. Bir diş xiyar.*

◊ **Canını dişinə tutmaq** – b a x **can**. **Diş ağartmaq** – b a x **dişini ağartmaq** 1-ci mənada. **Diş dəyişmək** – 1) b a x **diş dişəmək;** 2) *məc.* yeməyini dəyişmək, həmişə bir şey yeməmək. **Diş dişəmək** – diş təzələmək, yenidən diş çıxarmaq. *Uşaq keçən il dişlərini dişəməyə başlamışdır.* **Diş əti** – ağızda dişlərin dibini əhatə edən ət. **Diş göstərmək** – boyun əyməmək, boyun qaçırmaq. **Diş hədiyi** – uşaqların diş çıxarması münasibətilə bişirilən yemək. **Diş itiləmək** – 1) qisas, intiqam almaq, əvəz çıxmaq üçün səbəb aramaq, hazırlanmaq; 2) bir şeyə göz dikmək, ələ keçirməyə hazırlanmaq. **Diş keçirmək** – haqqı olmayan bir işə qarışmaq. **Diş kirəsi** *köhn.* – 1) keçmişdə kəndlilərdən alınan vergilərdən birinə xalq arasında verilən ad; 2) qonaqlıqdan əlavə qonağa verilən pul, mal və s. **Diş qıcamaq (qıcatmaq)** – 1) hədələmək, qorxutmaq. *Kinayəli baxışlarla diş qıcayır bir iblis tək; Ayırmayır gözlərini o, zəncinin dodağından..* S.Vurğun; 2) ələ keçirmək niyyətində olmaq, göz dikmək. **Diş qurdalamağa bir çöpü yoxdur** – çox kasıbdır, heç nəyi yoxdur. **Diş salmaq** – 1) qocalmaq (heyvanlar haqqında); 2) süni diş qoymaq. *Həkim onun dişlərini saldı.* **Diş taqqıldatmaq** – hədələmək, qorxutmaq. **Diş yeri** – bir şeyin dişləndiyi yerdə qalan diş izi, dişlək yeri. **Diş(i)-dırnağı ilə; dişi ilə, dırnağı ilə** – əzabla, əziyyətlə, çox məşəqqətlə. *Telli dişi ilə, dırnağı ilə çalışmış, axırda İslam üçün əməlli-başlı bir ev-eşik düzəltmişdi.* S.Hüseyn. // Var gücü ilə, bacardığı qədər. *Ayaz da diş-dırnağı ilə düşmənləri əzir, keçir; Qılınc, qalxan şaqqıltısı qorxu salır ürəklərə.* A.Şaiq. *Yenə o insan daşlardan, qayalardan tutacaq, dişi ilə, dırnağı ilə torpaqdan yapışıb qurtarmağa çalışacaqdır.* M.İbrahimov. **Dişə vurmaq** – b a x **dişinə vurmaq**. *Ancaq hələ bir dişimizə vuraq, bərkini-boşunu bilək.* C.Cabbarlı. **Dişə-dilə düşmək** – b a x **dilə-dişə düşmək** (**"Dil-diş"**də). **Dişi bağırsağını kəsmək** – daxilən əsəbi hal keçirmək, əsəbiləşmək, hirsini büruzə verə bilməmək. *Dişi bağırsağını kəsən Şirzad bura qədər durub gözlədi.* M.İbrahimov. *..Veys dişi bağırsağını kəsə-kəsə düşündü.* Ə.Əbülhəsən. **Dişi batmaq** – öhdəsindən gəlmək, gücü çatmaq. **Dişi batmamaq** – öhdəsindən gələ bilməmək, gücü çatmamaq, təsiri olmamaq, təsir edə bilməmək. [Kosaoğlu:] *..Kəndimizdə mənim əleyhimə qruppa var. Ancaq onu bilin ki, mənə heç kəsin dişi batmayacaq.* İ.Şıxlı. **Dişi dişinə dəymək** – b a x **dişləri bir-birinə dəymək**. *..Balaca Niyaz soyuqdan dişi*

*dişinə dəydikdə qeyri-ixtiyari olaraq anasının qolundan yapışdı..* M.İbrahimov. **Dişi qarnında olmaq** – hiyləgər, gizli iş görən adam haqqında. *Yox, düşmənin dişi qarnında olur.* S.Rəhimov. **Dişində şirə qalmaq** – dadanmaq, alışmaq, öyrəşmək, adət etmək. **Dişinə vurmaq** – sınamaq, dadmaq. **Dişini ağartmaq** – 1) acıq vermək, gülmək, istehza etmək. *Veys daxili bir həzlə* [Həmzəyə] *dişini ağartdı.* Ə.Əbülhəsən; 2) b a x **dişlərini ağartmaq**. **Dişini dişinə qıcamaq** – bərk hirslənmək. *Fərman dişini dişinə qıcadı: – Cəhənnəm ol!..* Ə.Abasov. **Dişini qıcamaq** – intiqam almaq üçün bəhanə aramaq, üzərinə atılmağa hazırlaşmaq. *İndi də dişini qıcamış Qacar; İranı talayır o qart canavar.* S.Vurğun. **Dişinin dibindən çıxanı demək** – ağzına gələni demək, bərk söymək. [Tahir:] *Yəni atan deyir ki, mənə dişinin dibindən çıxanı deginən?* M.Hüseyn. *Camaat xörək istəyir, müdir də qapının ağzında dayanıb hər gələnə elan eləyir ki, aşpaz qaçıb, sonra da Umudun qarasınca dişinin dibindən çıxanı deyir.* İ.Məlikzadə. **Dişləri bir-birinə dəymək, dişləri taqqıldamaq** – 1) soyuqdan, qorxudan, vahimədən qeyri-iradi olaraq dişləri bir-birinə dəymək. *Dişləri bir-birinə dəyir, bütün bədəni əsim-əsim əsirdi.* M.Rzaquluzadə; 2) bərk üşümək. **Dişlərini ağartmaq** – səbəbsiz gülmək, irişmək. *İndi isə hörmətli bir tanış kimi mənə salam verir və dişlərini ağardır.* M.S.Ordubadi. **Tamah dişini çəkmək**. – b a x **tamah**.

**DİŞAÇAN** *is. xüs.* Çarxlarda, mexanizmlərdə və s.-də diş (2-ci mənada) açan alət, dəzgah, maşın və s. *Bunların arasında dişaçan maşın, frezer avtomatı, preslər və s. vardır.*

**DİŞARASI** *sif. dilç.* Dişlərin arasında tələffüz olunan. *Dişarası samitlər.*

**DİŞARXASI** *sif.* 1. Dişlərinin dal tərəfinə yapışıq, ya yaxın olan. *Dişarxası ətlər.*

2. *dilç.* Dişlərin arxa tərəfində tələffüz olunan. *Dişarxası səslər.*

**DİŞBATAN** *sif.* Zəif yeri olan, möhkəm olmayan.

**DİŞBATMAZ** *sif.* Möhkəm, yenilməz, güççatmaz.

**DİŞBATMAZLIQ** *is.* Möhkəmlik, yenilməzlik, güççatmazlıq.

**DİŞCİK** *is.* 1. Kiçik diş.

2. *xüs.* B a x **diş** 2-ci mənada.

**DİŞCİKLİ** *sif. xüs.* Dişcikləri olan (b a x "**dişcik**" 2-ci mənada).

**DİŞÇƏKƏN** *is.* Yararsız dişi çəkmək üçün alət. // Yararsız dişi çəkən həkim.

**DİŞÇÖPÜ** *is.* Dişlərin arasını təmizləmək üçün çöp və s.

**DİŞ-DAMAQ** *is. dilç.* Diş və damağın vasitəsilə əmələ gələn (səs və s.). *Diş-damaq saitləri.*

**DİŞDAN** *sif. dan.* 1. Dişi düşmüş.

2. Dişləri iri olan.

**DİŞDAŞI** *is.* Dişlərdə əmələ gələn daşaoxşar xırda törəmə.

**DİŞDƏK**[1] *is. məh.* Həsir toxunmasında işlədilən dişli ağac alət.

**DİŞDƏK**[2] b a x **dişlək**. [Şahqulu:] *Artıq danışsan, vallah, səndən dişdək allam ki, ürəyin gedər, qəşş eylərsən.* N.Vəzirov.

**dişdək-dişdək** b a x **dişlək-dişlək**.

**DİŞDİ** *məh.* b a x **dişlə**.

**DİŞ-DİŞ** *sif.* Dişlər halında olan; üzərində dişlər, çıxıntılar, kərtiklər olan; kərtik-kərtik. *Faranın işığı hündür daş hasarın diş-diş divarına toxunub yayıldı.* İ.Məlikzadə. □ **Diş-diş olmaq** – dilim-dilim olmaq, diliklənmək, üzərində çoxlu çıxıntı əmələ gəlmək, kələ-kötür olmaq.

**DİŞƏ**[1] *is. bot.* Çöldə bitən və heyvan yemi kimi istifadə olunan dənli ot növü. *Yazın dumanlı günlərində yerdən göyərən dişə otları yeyən at hörükdə idi.* S.Rəhimov.

**DİŞƏ**[2] *is.* [*fars.*] Dişəmə aləti. *Dişə ilə dişəmək.*

**DİŞƏBƏNZƏR** *sif.* Şəkilcə dişə oxşayan.

**DİŞƏDƏYƏR** *sif.* Yeyilə bilən, yeməli. *Evdə dişədəyər bir şey yoxdur.*

**DİŞƏK** *tic.* Bir şeyin üzərində, kənarında olan dişlər, oyuqlar, çıxıntılar.

**DİŞƏK-DİŞƏK: dişək-dişək etmək** – bir şeyin üzərini dişəklə oyuq-oyuq, kələ-kötür etmək.

**DİŞƏKLİ** *sif.* 1. Dişəyi olan.

2. Kələ-kötür, girintili-çıxıntılı.

3. Kənarları diş-diş, dişək-dişək olan. *Dişəkli yarpaq.* // Dalayan. *Gicitkən yarpağı dişəkli olur.*

**DİŞƏLƏMƏK** b a x **dişəmək**.

**DİŞƏMƏ** "Dişəmək"dən *f.is.*

**DİŞƏMƏK** *f.* 1. Dəyirman daşını dişə ilə kələ-kötür etmək. *Qoca ikiağızlı yonğu çəkici ilə daş dişəyirdi.* S.Rəhimov.

2. Ağzı diş-diş olan alətləri itiləmək. *Mişarı dişəmək. Orağı dişəmək.*

3. Yaş yeddiyə çatanda diş tökmək. *Uşaq dişəməyə başladı.*

**DİŞƏNMƏ** "Dişənmək"dən *f.is.*

**DİŞƏNMƏK** *məch.* 1. Dişə ilə diş-diş edilmək, oyuq-oyuq edilmək, kələ-kötür edilmək.

2. İtilənmək (ağzı diş-diş olan alətlər). *Bıçqı dişənməlidir. Oraqlar dişəndi.*

**DİŞƏRMƏ** "Dişərmək"dən *f.is.*

**DİŞƏRMƏK** *f.* Cücərmək, çıxmaq. *Dağlar, çöllər dişərdi; Novruzgülü göyərdi.* A.Səhhət.

**DİŞƏRTİ** *is.* Təzə cücərmiş bitki. *Ləklərdə dişərtilər görünür.*

**DİŞƏTDİRMƏ** "Dişətdirmək"dən *f.is.*

**DİŞƏTDİRMƏK** b a x **dişətmək**.

**DİŞƏTMƏ** "Dişətmək"dən *f.is.*

**DİŞƏTMƏK** "Dişəmək"dən *icb. Dəyirmanın daşını ustaya dişətmək.*

**DİŞİ** *sif.* və *is.* 1. Canlıların doğan və yumurtlayan cinsi (*erkək* ziddi). *Dişi buzov. Madyan atların dişisinə deyilir. Dişi kəpənəyin qabaq qanadları tünd-darçını rəngə çalır. – ..Hər yuvada bircə dişi arı olar, ona şah deyərlər.* S.S.Axundov. // Qadın cinsi, qadın mənasında.

2. *dan.* Alətlərin bəzi növlərinin adına əlavə olunur. *Dişi rəndə ilə taxtalarda nov açırlar.*

3. Ağac və odunların yumşaq növü. *Dişi qovaq ağacı. Dişi şam ağacı.*

4. *dan.* Çiban kimi yaraların baş eləməyən növü. *Dişi çiban.*

**DİŞİCİK** *is. bot.* Bitki çiçəklərinin dişi döllük orqanı. [Ayıdöşəyikimilər fəsiləsinin] *dişicik və yumurtacıqları olmadığı üçün toxumları çılpaqdır. Toxumları yetişəndə qozaları .. giləmeyvə şəklini alaraq ətləşir.* H.Qədirov

**DİŞİCİKLİ** *sif. bot.* Dişiciyi olan (çiçək). *Narınçiçəyi üç tipdə: uzun dişicikli, qısa dişicikli və orta dişicikli olur.* İ.Axundzadə.

**DİŞİCİKSİZ** *sif. bot.* Dişiciyi olmayan (çiçək).

**DİŞİLİK** *is.* Dişi cinsin hal və keyfiyyəti.

**DİŞQARI** *is.* "Dışarı" sözünün qədim forması. *Əhali bir-bir komalarından dişqarı çıxıb, .. kəndin gen bir küçəsinə doğru gedirlər.* Ü.Hacıbəyov.

**DİŞQOZU** *is.* Qabığı nazik, xırda qoz.

**DİŞLƏ** *is.* [*rus.*] Arabaya qoşulmuş qoşa atın arasında olub, qabaq təkərlərin oxuna bənd edilən uzun ağac. *Faytonun dişləsi. Dişlə atı.*

**DİŞLƏK** 1. *is.* Dişlənmiş bir parça. ◻ **Dişlək vurmaq (götürmək)** – dişləmək, dişlə qoparmaq. *..Arabaçı .. armuda dişlək vura-vura atları tərpətdi.* Ə.Əbülhəsən.

2. *is.* Diş yeri.

3. *sif.* Dişlənmiş, dişlə qopardılmış, diş yeri qalmış.

**dişlək-dişlək** *zərf* Hər yeri dişlənmiş halda.

**DİŞLƏM** *is.* b a x **dişlək** 1 və 2-ci mənalarda. ◻ **Dişləm-dişləm etmək** – hər yerini dişləmək, dişlənməmiş yer qoymamaq.

**DİŞLƏMƏ** "Dişləmək"dən *f.is.* ◻ **Dişləmə çay** – kiçik qənd parçası və ya şirni ilə içilən çay; acı çay. *Dustaqların hərəsinə bir yekə qara çörək ilə bir stəkan dişləmə çay gətirdilər.* C.Məmmədquluzadə. [Xortdan:] *Bir nəfər .. qabağında bir stəkan dişləmə çay .. bir kəndli ilə mübahisə eləyirdi.* Ə.Haqverdiyev. [Qənbərqulu:] [Əsgərin] *yediyi, içdiyi həmişə dişləmə çay ilə quru çörək idi.* B.Talıblı.

**DİŞLƏMƏK** *f.* 1. Dişləri arasında sıxmaq, dişlərini batırmaq. *Cavan ana öz körpəsinin toppuş ayaqlarını birdən dişləyir, uşaq qıdıqlanıb gülürdü..* S.Rəhimov.

2. Dişləri ilə sıxıb qopartmaq, kəsmək. *Armudu dişləmək. Çörəkdən bir tikə dişləmək. – Ağ almanı dişlədim; Dörd yanın gümüşlədim.* (Bayatı). // Yemək mənasında. *İşləməyən dişləməz.* (Məsəl).

3. Sancmaq, dalamaq. *Gicitkən dişləyir. – Hər kəs məndən səni yaman qandırsa; Ya əqrəb dişləsin, ya ilan, pərim!* Aşıq Abbas.

**DİŞLƏMLİK** *sif.* Adətən, saylarla – ...dəfə dişləmək, dişləyib qopartmaq üçün kifayət edən. *İki dişləmlik qənd.*

**DİŞLƏNMƏ** "Dişlənmək"dən *f.is.*

**DİŞLƏNMƏK** *məch.* 1. Dişlər arasında sıxılmaq.

2. Diş ilə qoparılmaq, kəsilmək.

**DİŞLƏNMİŞ** *f.sif.* 1. Diş yeri qalmış, diş izləri görünən.

2. Dişlə qopardılmış, dişlə sındırıb qopardılmış. *Dişlənmiş qənd.*

**DİŞLİ** *sif.* 1. Dişi, dişləri olan; diş-diş. *Dişli çarx. Kənd təsərrüfatı maşınqayırma zavodları üç cür dişli mala buraxırdı.*

2. *məc. dan.* Sözükeçən, ağızlı, nüfuzlu. *Dişli adam.* – [Allahyar:] *Özün bilirsən ki, onlar dişli tayfadırlar.* İ.Şıxlı.

**DİŞLİCƏ** *is. bot.* Səhləb fəsiləsindən birləpəli bitki (yarpaqları xalq arasında boyaqçılıqda işlədilir).

**DİŞLİLİK** *is.* 1. Dişli şeyin halı və keyfiyyəti.

2. *məc. dan.* Sözü keçmə, nüfuzluluq, ağızlılıq.

**DİŞRƏ** *köhn.* bax **dışarı**. *Kim, dişrədə istəyəm nişanın; Bir özgə məkan biləm məkanın.* Füzuli. *Hamı çıxdı, ancaq Yusif şah qaldı təxtin üstündə, qabağında Xacə Mübarək, başqa bir neçə xacə ilə və Əzim bəy pişxidmətbaşı və bir neçə pişxidmət və otaqdan dişrə fərraşlar.* M.F.Axundzadə. *Könüldən dişrə bir yer olduğun aşiq xəyal etməz..* B.Vahabzadə.

**DİŞSİZ** *sif.* 1. Ağzında dişləri olmayan. *Dişsiz ağız – dişsiz dəyirman.* (Ata. sözü). *Kişi quru çörəyi dişsiz damağında övkələdikcə çənəsi şaqqıldayır, gicgahlarındakı damarlar oynayırdı.* İ.Şıxlı.

2. *məc. dan.* Zəif, sözü keçməyən, ağzıboş, nüfuzsuz, iradəsiz. [Zübeydə:] *Qoca indi dişsiz bir ilandır, ömrünün qalanını zindanda qalmalıdır.* Ə.Məmmədxanlı.

**DİŞSİZLİK** *is.* 1. Ağızda dişlərin olmadığı hal.

2. *məc. dan.* Zəiflik, sözükeçməzlik, iradəsizlik.

**DİTDİLİ** *is. məh.* Ağcaqanad. *Qərvənd çox ditdili və milçək olan yerdi.* Ə.Haqverdiyev. *Durğun suyun qırağında toz kimi ditdili uçuşurdu.* Mir Cəlal.

**DİV** *is.* [*fars.*] Şərq nağıllarında: müsbət qəhrəmanlara qarşı qoyulan çirkin, eybəcər, həddən artıq cəsamətli, buynuzlu əfsanəvi vücud, heyvan. *Div ilə pəri olurmu həmdəm?* Füzuli. *Özgələri meşədə ayıdan ehtiyat eləyəndə müsəlmanların yadına div düşür.* C.Məmmədquluzadə. *Yetim uşaqlar, kasıb adamlar, keçəllər nağılın axırında divlərə, əjdahalara, padşahlara qalib gəldikdə, balaca Süleymanın da sevincinin həddihüdudu olmazdı.* S.S.Axundov. // *məc.* Çox güclü, qüvvətli, cəsamətli adam və s. haqqında. *Söküb dağıdardın sahillərini; Qayalar bilirdi div hünərini.* R.Rza.

◊ **Div addımları ilə** *tənt.* – çox böyük sürətlə, çox iti. *Div addımları ilə irəliləmək.*

**DİVAN**[1] *is.* [*fars.*] *köhn.* 1. Məhkəmə, tribunal. *Əgər Kərbəlayı Heydərin ona iki yüz manat borcu var, kağızını qoysun divana.* C.Məmmədquluzadə. [Tarverdi:] *İstəmirəm məsum bir qız mənim üçün divanlara sürülsün..* C.Cabbarlı. *Hər iki oba divan qabağında onların üzərinə basqın olduğunu isbata qalxmışdı.* S.Rəhimov. □ **Divan qurmaq** – məhkəmə qurmaq. [Şəmsəddin bəy:] *Mənə böyük divan qurmuşdu.* S.S.Axundov. *Nəsimi zahidlə durdu üz-üzə; Söylədi: – Həqq adlı bir divan quraq.* S.Vurğun. **Divanını kəsmək** – mübahisələrini (davalarını) həll etmək. [Xan:] *Vallah, bilmirəm ki, bunların divanını necə kəsim? Heç belə çətin davaya rast gəlməmişdim.* M.F.Axundzadə.

2. *tar.* Ali hökumət məclisi; divanxana, hökumət idarəsi, dövlət dəftərxanası. *Dövlətliyik, əlbəttə, şərafət də bizimdir; Divan bizim, ərbabi-hökumət də bizimdir.* M.Ə.Sabir. □ **Divan qurulmaq** – ali hökumət məclisi çağırılmaq. // *köhn.* Ümumiyyətlə, hökumət idarələri, hökumət. *Mərd olub nər kimi girək meydana; Gücümüzü göstərək bu gün divana.* "Qaçaq Nəbi". [Dilənçi:] *Oğlum, indi gərək adını da dəyişdirəsən, çünki Əmiraslan sənin itməyini, yəqin, divana məlum edəcəkdir.* S.S.Axundov. *Verdi qaçaqlara bu növ xəbər: – Divan tədbir edib sizi tutmağa.* H.K.Sanılı. // *köhn.* Hökumət məmurları və ya nümayəndələri. *Elə olmasın ki, divan kəndə girsin, mən hamıdan sonra duyuq düşüm.* S.Rəhimov. *Yazıq kişi acsusuz, ayaqyalın, başıaçıq, gözüyaşlı .. divan adamlarına yalvarırdı.* Mir Cəlal.

◊ **Divan(ını) etmək** – cəzalandırmaq, tənbeh etmək, toy tutmaq. [Hacı Murad:] *Mənim xəbərim yoxdur, bu saat sizin divanınızı edəcəyəm.* S.S.Axundov. **Divan tutmaq**

– məcbur etmək, yaxud cəzalandırmaq məqsədi ilə amansızcasına zor işlətmək. [Ağa Məhəmməd şah Qacar:] *Gərək güclü qoşun götürüb gedəsən Kirmana. .. Gərək Kirman əhlinə bir divan tutasan ki, cəmi İran titrəsin.* Ə.Haqverdiyev. *Amma arxayın ol, əziz və unudulmaz Vətən, qızlarına nə qədər divan tutsalar da, onların mərd ruhu qırılmır, onların dili düşmənə yalvarmır.* Ə.Məmmədxanlı.

**DİVAN**[2] *is.* [*fars.*] Yaxın və Orta Şərq ədəbiyyatında: bir və ya bir neçə şairin qafiyə və ya rədiflərinin axırıncı hərflərinə görə əlifba sırası ilə düzülmüş şeirlər məcmuəsi. *Füzuli divanı.* – [Xortdan:] *Tanımayanlar var isə, vəzir Mirzə Ağasının divanını oxusunlar.* Ə.Haqverdiyev.

**DİVAN**[3] *is.* [*fars.*] Oturmaq və ya uzanmaq üçün uzun yumşaq taxt. *Yumşaq meşin divanlarda, bilmirəm, nə xasiyyət var ki, eləcə oturan kimi yuxuya cumursan.* C.Məmmədquluzadə.

**DİVAN**[4] *is.* [*fars.*] *tar.* Türkiyə sultanlığında məşvərətçi orqan.

**DİVANBƏYİ** *is. tar.* XIX əsrdə: mahal inzibat idarəsinin rəisi. [Müsyö Jordan:] *Bu saatda Təbrizdə oturan ingilis konsulundan sizin divanbəyiniz mənə kağız yetirdi.* M.F.Axundzadə. [Məmmədəli:] *Zarafat deyil. Sən ağzında divanbəyi deyirsən.* N.Vəzirov.

**DİVANBƏYİLİK** *is. tar.* Divanbəyi vəzifəsi.

**DİVAN-DƏRƏ** *dan. köhn.* bax **divan**[1]. [Aydəmir:] *Mən deyirdim, divan-dərə görməmiş qız qapılara düşməsin.* C.Cabbarlı. [Qədir:] *Divan-dərə qapısı görməmişəm. Birinə güldən ağır söz demirəm.* Mir Cəlal. *Mən saç-birçəyimi divan-dərə qapısında ağartmışam.* Ə.Vəliyev.

**DİVANƏ** *is.* [*fars.*] Dəli. *Məcnun tək divanəyəm; Gəzirəm dağda-daşda.* (Bayatı). *Divanəmisən? Yaxud da axmaq? Get, yoxsa yeyərsən əlli toxmaq.* Xətayi. // Sif. mənasında. *Divanə dərviş.* – *Qəm çəkmə bu qədər, divanə könül; Həmişə ruzigar belə dar olmaz.* Qurbani. *Divanə qadının o ağ saçları; Dağılıb çiyninə səpələnmişdir.* S.Vurğun. ☐ **Divanə etmək** – dəli etmək, ağlını başından almaq. *Divanə etməyincə götürməz yaxandan əl; Çox çəkdim imtahanə bu zülfü qərələri.* Ə.Vahid.

**DİVANƏCƏSİNƏ** bax **dəlicəsinə**.

**DİVANƏLƏNMƏ** "Divanələnmək"dən *f.is.*

**DİVANƏLƏNMƏK** *f.* Divanə olmaq, dəli olmaq. *Genə bir leylivaş yarə dil verdi; Könül Məcnun təki divanələnmiş.* M.V.Vidadi. // Dəlilik etmək.

**DİVANƏLƏŞMƏ** "Divanələşmək"dən *f.is.*

**DİVANƏLƏŞMƏK** *f.* Divanə olmaq, dəliləşmək, getdikcə ağlını itirmək.

**DİVANƏLİK** *is.* Dəlilik. *Ta düşdü dillərə qəmi-eşqim hekayəti; Divanəlikdə tutdu sözüm hər vilayəti.* S.Ə.Şirvani. ☐ **Divanəlik etmək** – dəlilik etmək, dəli kimi hərəkət etmək, axmaq hərəkət etmək, ağılsızlıq etmək. [Sitarə:] *Nə işdir bu, bu nə divanəlikdir eyləyirsən sən?* C.Cabbarlı.

**DİVANƏSƏR** [*fars.*] *klas.* bax **divanəvar**. *Sonra gündən-günə divanəsər etdin məni sən; Məktəbimdən soyudub, dərbədər etdin məni sən.* A.Səhhət. *Ancaq demə tacirlərə eşqin əsər etdi; Divanəsər etdi.* M.Ə.Sabir.

**DİVANƏVAR** *zərf* [*fars.*] *klas.* Dəli kimi, dəlicəsinə. *Sadıq bəy gedir, xan divanəvar gəzinir.* Ə.Haqverdiyev.

**DİVANƏVƏŞ** [*fars.*] *klas.* bax **divanəvar**. *Mənim divanəvəş könlüm; Bir zülfi-piçu tab istər.* Məhəmməd bəy aşıq.

**DİVANXANA** *is.* [*fars.*] *köhn.* 1. Bolşevik inqilabından əvvəl: yerlərdə olan inzibati hökumət idarələrinə verilən ümumi ad. // Bu idarələrin yerləşdiyi bina. *Bunların çoxu bilmir ki, nə işdən ötrü, nə təqsirin və hansı əməlin ucundan onları divanxana qabağına toplayıblar.* F.Köçərli.

2. Məhkəmə və onun yerləşdiyi bina. [Hacı Fərəc:] *Divanxanalarda bütün məmurları təngə gətirmişəm.* N.Vəzirov. *Arvad bədbəxt olub atası evində qalardı. Atası da axund otağında, divanxanalarda kəbin və talaq davası edərdi.* H.Sarabski.

3. *tar.* Şərq ölkələrində: padşah saraylarında rəsmi qəbul otağı. *Fəxrəddin və Ələddin baş endirib Toğrulun divanxana otağından çıxdılar.* M.S.Ordubadi. *Şərq ölkələrində saray səciyyəli yaşayış binalarının rəsmi qəbul hissəsi divanxana adlanır*. Ə.Salamzadə.

**DİVANİ**[1] *is.* [*fars.*] *folk.* Hər misrası 15 hecadan, hər bəndi isə 4 misradan ibarət olan aşıq şeir forması.

**DİVANİ**[2] *sif.* [*fars.*] *köhn.* 1. Divana, hökumətə aid olan.

2. Xüsusən rəsmi fərman və əmrlərin yazıldığı ərəb yazısı növlərindən birinin adı.

**DİVAR** *is.* [*fars.*] 1. Binaların üstünü saxlamaq və daxilini bölmələrə ayırmaq üçün müxtəlif tikinti materiallarından çəkilən sədd. *Daş divar. Divara kağız çəkmək. Divarın üz tərəfi. – Muxtar əmi evin eşik divarına söykəndi.* M.Hüseyn. *Divardan asılmış şəkil Əzizi bir az qəmgin elədi.* S.Rəhman. ☐ **Divar kağızı** – suvanmış otaq divarlarına yapışdırılan naxışlı kağız. **Divar qəzeti** *köhn.* – idarənin, müəssisənin, yaxud məktəbin işlərini, müvəffəqiyyət və nöqsanlarını əks etdirən, divardan asılan qəzet. .. [Dilbər] *"Yüksək məhsul" adlı divar qəzetini çıxarmağa çox vaxt sərf edirdi.* Ə.Sadıq. **Divar peçi (sobası)** – divarın içində hörülmüş peç, buxarı. *Divar peçləri hələ təzəcə qalanırdı.* S.Rəhimov. **Divar saatı** – divardan asılan saat. *Divar saatı gecə saat bir zəngini təzəcə vurmuşdu.* M.S.Ordubadi. *Dəhlizdəki divar saatında on iki olmuşdu.* M.Hüseyn. **Divar şkafı** – divarın içində olan şkaf. *Şoferin fikri-zikri yenə divar şkafında idi.* M.Hüseyn.

2. Həyətlərin (keçmişdə həm də şəhər və qalaların) ətrafını əhatə edən daşdan, kərpicdən və s.-dən tikilən uca barı; hasar. *Qala divarı. Kreml divarları. – Uca atın üstündə oturub kəndin alçaq divarlarından həyətin hamısını görürdüm.* C.Məmmədquluzadə.

3. Müxtəlif qabların, yeşik, çəllək və s. şeylərin yan tərəfi. *Çənin divarı. Sandığın divarları. Borunun divarı.* // Bəzi bədən üzvlərinin yan tərəfi. *Bağırsağın divarları. Göz almasının divarı üç qişadan ibarətdir.*

4. *məc*. Maneə, sədd mənasında. *Aramızda bir divar vardır.*

◊ **Divara dirəmək (qısnamaq)** – danışıq və ya mübahisə zamanı birini çıxılmaz vəziyyətə salmaq, sıxışdırmaq. **Dörd divar(ın) arasında** və ya **içində qalmaq (oturmaq)** – xarici aləmlə, heç kəslə əlaqə saxlamamaq. [Asya Gülçöhrəyə:] *Sən bu dörd divarın içində kimi görə bilərsən, a yazıq!..* Ü.Hacıbəyov.

**DİVARCIQ** *is.* Kiçik divar, alçaq divar.

**DİVARLI** *sif.* Divarı olan, divar (hasar) çəkilmiş. *Divarlı bağ. Sarı samanla suvanmış olan palçıq divarlı otaqların birində böyük şairə Məhsəti xanım, o birində isə şairin özü yaşayırdı.* M.S.Ordubadi.

**DİVARLIQ** *sif.* Divar üçün yararlı, münasib. *Divarlıq daş.*

**DİVCİK** b a x **divzad**.

**DİVERSÁNT** [*lat.*] Diversiya (təxribat) işi aparan adam, təxribatçı.

**DİVÉRSİYA** [*lat.*] 1. Zərbə vurulacaq yerdən düşmənin fikrini yayındırmaq üçün aparılan hərbi əməliyyat.

2. Xarici dövlət və ya sinfi düşmən təşkilatları agentləri tərəfindən aparılan təxribatçılıq işi.

**DİVERTİSMÉNT** [*fr.*] Əsas tamaşaya və ya konsertə əlavə olaraq göstərilən musiqili, yaxud dramatik tamaşa.

**DİVGÖVDƏ(Lİ)** *sif.* Gövdəsi çox yekə, çox cəsamətli və biçimsiz.

**DİVİDÉND** [*lat.*] *mal.* Səhmdarlar cəmiyyəti üzvləri arasında bölünməli olan gəlirin bir hissəsi; hər bir səhmdarın payına düşən gəlir.

**DİVİZİÓN** [*fr.* əsli *lat.*] 1. Topçu, bəzən zirehli tank və atlı qoşun hissələrində bölmə. *Divizion komandiri. Divizion qərargahı.*

2. Eyni tipli hərbi gəmilər dəstəsi. *Sualtı qayıqlar divizionu. Mina gəmiləri divizionu.*

**DİVÍZİYA** *is.* [*lat.*] Bir neçə alay və briqadadan ibarət qoşun birləşməsi. *Piyada diviziyası. Tank diviziyası.*

**DİVQILIQ** *sif.* Div xasiyyətli, pis xasiyyətli, yolagetməz. *Divqılıq adam.*

**DİVZAD** *is.* [*fars.*] Nağıllarda: div balası, balaca div.

**DİYAR** *is.* [*ər.*] Ölkə, məmləkət.

**diyar-diyar** b a x **diyarbədiyar**. *O göyərçin ki, gəzdi dünyanı diyar-diyar; ülfətin carçısı kimi; sənin qəlbinin canlı parçası kimi.* R.Rza.

**DİYARBƏDİYAR** *zərf* Bu ölkədən o ölkəyə; ölkələri dolaşaraq. *Aşıq deyər, budu yar; Xalın deyər, budu yar; Qoydun kamana məni; Atdın diyarbədiyar.* Sarı Aşıq. [Rəhim:] *On ildir mən diyarbədiyar düşüb onların ata-anasını axtarıram..* N.Vəzirov.

**DİYƏ** *is.* [*ər.*] *köhn*. Keçmiş zamanda: öldürülmüş adam və ya heyvan əvəzinə öldürənin verməli olduğu mal və ya pul; qanbahası. [Əvvəlinci ərizəçi:] *İndi at məsrəfdən çıxıbdır, diyəsini istərəm..* M.F.Axundzadə.

**DİYİN** *is. məh*. Atın boynuna bağlanan ip; çatı. [Dərviş:] *Diyin atın boğazında irəlidən hazır idi.* A.Divanbəyoğlu.

**DİYİRCƏK** *is.* 1. Yeni ayaq açan uşaqları yeriməyə öyrətmək üçün arabacıq; yüyürək.

2. Kiçik metal təkərcik (məs.: mebellərin, royalların və s. ayaqları altında).

3. Təkərcikli konki.

4. *tex*. Müxtəlif maşın və mexanizmlərdə: barabana və ya təkərəoxşar kiçik blok.

**DİYİRCƏKLİ** *sif.* Diyircəyi, yaxud diyircəkləri olan, diyircək üzərində duran, diyircək vasitəsilə hərəkət edən. *Diyircəkli stol. Diyircəkli konki.*

**DİYİRLƏK** *is*. Ağır bir şeyi bir yerdən başqa bir yerə diyirlədib aparmaq üçün altına qoyulan dəyirmi ağac, boru parçası və s. *Vışka öz elektromotoru vasitəsilə çəkildikdə, vışkanın və sarayın altına yenə də diyirləklər qoyulur.* S.Quliyev.

**DİYİRLƏMƏ** "Diyirləmək"dən *f.is.*

**DİYİRLƏMƏK** bax **diyirlətmək**.

**DİYİRLƏNMƏ** "Diyirlənmək"dən *f.is.*

**DİYİRLƏNMƏK** *f.* Yuvarlanaraq bir istiqamətə doğru hərəkət etmək, yuvarlanmaq (dəyirmi, yuvarlaq şeylər haqqında). *Diyirlənən bu yöndəmsiz .. düşmən tankı idi.* Ə.Məmmədxanlı.

**DİYİRLƏTMƏ** "Diyirlətmək"dən *f.is.*

**DİYİRLƏTMƏK** *icb*. Dəyirmi, yuvarlaq şeyi bir istiqamətə doğru yuvarladaraq hərəkət etdirmək. *Çəlləyi diyirlətmək. – Valla oyuncaq avtomaşınını fərişin üstü ilə diyirlədərdi.* S.Rəhimov.

**DİZ** *is.* 1. Qıçın diz oynağı olan hissəsi, bükülən yeri. *Dizlərini bükmək. – Getdim bağa üzümə; Tikan batdı dizimə.* (Bayatı). *Göy ot dizdən yuxarı qalxmışdı.* C.Məmmədquluzadə. □ **Diz qapağı** – dizin üstündəki sümük. [Nurəddinin] *sağ ayağı diz qapağından çıxmışdır*. S.S.Axundov. [Qədir] .. *ovucları ilə diz qapaqlarını ovdu, ayaqlarını oynatdı.* Mir Cəlal. **Diz oynağı** – baldır sümüyünü bud sümüyü ilə birləşdirən oynaq. // Şalvarın, qıçın həmin yerini örtən hissəsi. *Şalvarın dizləri sürtülüb.*

2. Qıçın diz oynağından buda qədər olan hissəsi. *Uşağı dizi üstündə oturtmaq. – ..Kərbəlayı Cəfər dizi üstə oturub üzüqoylu düşmüşdü çörəyin üstə.* C.Məmmədquluzadə.

◊ **Diz çökdürmək, diz üstə çökdürmək** – zorla tabe etmək, tabe olmağa, təslim olmağa məcbur etmək. *Tarixi əzmiylə yaradanları; Niyə çökdürdünüz bu gün diz üstə?* B.Vahabzadə. **Diz çökmək, diz üstə çökmək** – 1) dizlərini yerə dayayaraq oturmaq və ya təzim əlaməti olaraq dizlərini yerə qoyaraq əyilmək. *Uşaqların əllərindən tutub gedirəm o bədbəxtin yanına, diz üstə çöküb yalvarırıq, əlac olmayır.* N.Vəzirov. *Məhkum ayağa qalxaraq, Abbasqulu ağanın qarşısında diz çökdü...* Ə.Sadıq; 2) *məc*. tabe olmaq, itaət etmək, təslim olmaq. [Qətibə:] *Əlahəzrətin özü, Qızıl Arslanın qarşısında diz çökəcəyini görəcəkdir.* M.S.Ordubadi. *Tarix özü şahid olub; Bu dostluğun qarşısında; Düşmənin diz çökdüyünə.* R.Rza. **Dizə çıxmaq** – həddən artıq çox olmaq. *Zibil dizə çıxırdı. – Gün isti, yer qızğın, toz çıxır dizə; Çibinlər, milçəklər soxulur gözə.* H.K.Sanılı. **Dizlərini qucmaq (qucub oturmaq)** – məyus, aciz, naəlac bir halda oturmaq, yazıq-yazıq oturmaq. *Bir neçə gün bundan əqdəm şadlığından bilmirdin nə edəsən, indi dizlərini qucub qafiləsi vurulmuş ərəbə oxşayırsan, məgər nə olub?* N.Vəzirov.

**diz-dizə** bax **dizbədiz**. *Oturaydım dizdizə; Baxaydım gül üzünə.* (Bayatı). *Təbiət bizimlə durub diz-dizə; Başından keçəni danışır bizə.* S.Vurğun.

**DİZALTI** *sif.* Dizin alt tərəfində olan. *Dizaltı damar.*

**DİZAYN** *is.* [*ing.*] Kompozisiya, quruluş, tərtib.

**DİZBƏDİZ** *zərf* Üz-üzə, bir-birinə lap yaxın. *Dizbədiz oturmaq.*

**DİZ-DİZİ** *zərf* Dizləri üstündə, dizləri üstündə sürünərək. *Diz-dizi yerimək. – Uşaqların çoxusu həftələrlə yeriyə bilməzdi, mollaxanadan evlərinə diz-dizi gedərdilər.* H.Sarabski.

**DİZEL** [alman ixtiraçısı Dizelin adından] 1. Maye yanacaqla işləyən mühərrik. *Dizel mühərriki.*

2. *dan*. Dizel mühərriki ilə işləyən avtobus. [Qurban:] *Biz də tərpənək, Telli, çamadanı bəri ver, dizel burada, qapı ağzındadır.* Ə.Məmmədxanlı.

**DİZELLİ** *sif.* Dizel mühərriki olan, dizel ilə işləyən, hərəkətə gətirilən. *Dizelli avtomobil. Dizelli qatar.*

**DİZENTERİYA** *is.* [*yun.*] *tib*. Kəskin yoluxucu bağırsaq xəstəliyi; qanlı ishal. *Atəvəliyinin köklərindən dizenteriya xəstəliyinin müalicəsində istifadə edilir.* R.Əliyev.

**DİZENTERİYALI** *sif.* Dizenteriyaya (qanlı ishala) tutulmuş. *Dizenteriyalı xəstə.*

**DİZİN-DİZİN** *zərf* Diz üstə, diz-dizi. □ **Dizin-dizin sürünmək (süründürmək)** – 1) ayaq üstündə dura və ya gedə bilməyib diz üstə sürünmək (süründürmək). *Bir ağrı tutdu ki, dizin-dizin sürünüb əlimlə ot yoldum.* Ə.Haqverdiyev. *Misirli dostlar! Göz dikib torpağınıza qəsbkarlar sizin; Sürünür kölgənizcə əlibıçaqlı dizin-dizin.* O.Sarıvəlli. *Molla .. şikara yaxınlaşmaq məqsədi ilə dizin-dizin ona, Fatmaya doğru süründü.* P.Makulu; 2) qarğış və ya and yerində işlənir. [Nurcahan:] *A səni görüm, dizin-dizin sürünəsən!* N.Vəzirov. [Mirzə Heydər:] *Sənin evində yediyim çörək məni dizin-dizin süründürsün, əgər mən bu barədə qələm çalmışam.* Ə.Haqverdiyev.

**DİZLƏMƏ** "Dizləmək"dən *f.is.*

**DİZLƏMƏK** *f.* Dizi ilə vurmaq.

**DİZLİK** *is.* 1. Kişilərin şalvar altından geydikləri (əsasən ağdan tikilən) alt tuman. *Yasavul şalvarını çiyninə atmış, ağ dizlikdə yollarda toza bata-bata sürünürdü.* S.Rəhimov. *..Dizliklərimi yamayır, çarıqlarımı təmizləyir.* Mir Cəlal.

2. Qadınların üstdən geydikləri enli tuman. *Köhnə çarqat, köhnə ağ çit arxalıq və köhnə solmuş şiləyi dizlik – övrətin libası budur.* C.Məmmədquluzadə. *Döşəkcə, tuman adına; Geyərdilər o dizliyi; Tutardı on adam yeri; Onu geyəndə Xanbacı.* M.Möcüz. *Alaçıqların yanında dizlik geymiş, belinə şal bağlamış iki-üç qadın tərpənirdi.* M.İbrahimov.

3. Zərbədən, zədələnmədən qorumaq üçün dizə sarılan, yaxud keçirilən sarğı və s. *Dəri dizlik. – ..İdmanda zədələnmə hallarının qarşısını almaq üçün ən yaxşı qayda qoruyucu vasitələrdən, məsələn, sipərlərdən, dizliklərdən və s.-dən istifadə edilməsindən ibarətdir.* Ə.Babayev.

**DİZMARI** *is. məh*. 1. Giləsi böyük, tumları iri üzüm növü.

2. Həmin üzümdən qurudulmuş mövüc.

**DİZOTU** *is. bot*. Rütubətli çəmənliklərdə bitən ot bitkisi.

**DO**[1] *nida*. Öküz, camış kimi heyvanları səsləmək üçün çıxarılan səs. □ **Do demək** – 1) heyvanı "do" səsi ilə səsləmək. *Heyvanlara bir "do!" de, bəri gəlsinlər*; 2) *dan*. kömək etmək, imdada yetmək. *Onun bir işə do dediyini hələ eşitmədim.*

**DO**[2] [*ital.*] Musiqi qammasının başlanğıc səsi, habelə bu səsi göstərən not.

**DOD: dod vermək** – b a x **dodu vermək** (**"dodu"**da).

**DODAĞABƏNZƏR** *sif.* İnsan dodağına bənzəyən, dodağa oxşayan.

**DODAĞAOXŞAR** b a x **dodağabənzər**.

**DODAĞISALLAQ** *sif.* Alt dodağı sallanmış halda olan. *Dodağısallaq adam.*

**DODAĞISÖZLÜ** *is. dan*. Bəzəkçi, sözbaz.

**DODAĞIYOĞUN** b a x **qalındodaq**.

**DODAQ** *is.* 1. Ağız kənarlarını təşkil edən iki mütəhərrik dəri-damar büküklərindən hər biri. *Adamın iki dodağı olur. Alt dodaq. Üst dodaq. Nazik dodaq.* – [Əhməd:] *Qara saçları, eşqlə dolu uzun kirpikli gözləri, ərəbi burnu, hamısından artıq gözəl balaca ağzı, qırmızı dodaqları mənim xoşuma gəldi.* T.Ş.Simurq.

2. Bir şeyin (qabın və s.-nin) kənarı, qırağı. *Banka dodağına qədər doludur.* // Məc. mənada. *Dənizin dodaqları torpağı öpən yerdə; Bir qul kimi bağlanmış; Sahillərə ana yurdu; Badam gözlü çinlilərin.* R.Rza. // Bəzən çiçəklərin dodaq şəklində olan bölüklərinə deyilir.

3. Müxtəlif alətlərin tutucu, sıxıcı hissəsi (bu mənada ancaq cəm şəklində işlənir). *Mənqənənin dodaqları.*

◊ **Dodağı qaçmaq** – b a x **dodaqları qaçmaq**. [Sarxan] *gələndə ən qaşqabaqlı adamların da dodağı qaçırdı.* M.İbrahimov. *Əziz gülümsündü, qızın da dodağı qaçdı.* Ə.Vəliyev. **Dodağı yer süpürmək** – b a x **dodağı yerlə getmək**. **Dodağı yerlə getmək** – küs-

mək, incimək, çox pərt olmaq, qaşqabağını sallamaq. *Sadıq kişinin qaşları çatılmışdı. Dodağı da yerlə gedirdi.* M.Hüseyn. **Dodağını büzüşdürmək** – b a x **dodaq büzmək** 2-ci mənada. **Dodağını dişləmək** – birdən bir şey yadına düşmək, xatırlamaq. *Ayna dodaqlarını dişlədi.* Ə.Məmmədxanlı. **Dodağını sallamaq** – küsmək, qaşqabağını tökmək, acıq eləmək, pərt olmaq. [Mirzə] *dodağını sallamışdı.* Mir Cəlal. **Dodağının altında** – b a x **dodaqaltı**. *Bahadır dərin-dərin fikirdə ikən, Novruz dodağının altında oxuyurdu..* N.Nərimanov. *Rəna dodağının altında mırıldandı...* S.Rəhimov. **Dodağının altından gülmək** – istehza etmək, istehza yolu ilə gülümsəmək, qımışmaq. **Dodağının altından söylənmək** – mırtıldanmaq, deyinmək, donquldanmaq. **Dodaq büzmək, dodağını (dodaqlarını) büzmək** – 1) narazılıq göstərmək; 2) istehza etmək. *Qoca kəndli gülərək bu sözə dodaq büzdü; Əmniyyə rəisini başdan-ayağa süzdü.* S.Rüstəm; 3) ağlamsınmaq, kövrəlmək, doluxsunmaq. *Uşağa acıqlandım, dodağını büzdü*; 4) naz əlaməti olaraq dodaqlarını büzmək; gülümsünmək. *Kiçikbəyim albalı rəngli dodaqlarını xoş bir əda ilə büzdü.* Çəmənzəminli. **Dodaq çuxuru** – üst dodağın ortasında burunun qabağındakı batıq yer. *Üst dodağın çuxuru iki bığın arasıdır*. **Dodaq sallamaq** – küsmək, qaşqabağını tökmək, acıq eləmək, pərt olmaq. **Dodaq-dodağa** – dodaqlarını bir-birinə yapışdıraraq. [Əşrəf Rozaya:] *..Ətrafımızdakı çiçəklərin dodaq-dodağa öpüşməsi nə qədər munis, nə qədər şairanə.* H.Cavid. **Dodaq-dodağa vermək** – ağız-ağıza vermək. *Dayan, mən də çıxım evdən bağçaya; Ötək verib dodaq-dodağa, bülbül!* M.Rahim. **Dodaqları ağarmaq** – bir hadisənin təsiri nəticəsində dodaqlarının qanı qaçmaq, dodaqları bozarmaq. **Dodaqları altında** – b a x **dodaqaltı**. *Mixail baba dodaqları altında mırıldanaraq kürkünü başına çəkdi.* S.S.Axundov. **Dodaqları büzülmək** – 1) narazılıq, xoşnudsuzluq ifadə etmək. *Qadın o saat dəyişildi, gözəl dodaqları büzüldü, qaşları qalxdı, üzündə bir xoşnudsuzluq ifadəsi duyuldu.* Çəmənzəminli; 2) ağlamsınmaq. **Dodaqları qaçmaq** – gülümsünmək. *Muradın dodaqları qaçdı. Üzündə bir gülümsəmə əlaməti vardı.* S.Hüseyn. **Dodaqlarını çeynəmək** – qəzəb əlaməti olaraq dodaqlarını gəmirmək. *Nadir yumruğunu qaldırıb, bütün gücü ilə dizinə vurdu. Dodaqlarını çeynəməyə başladı.* B.Talıblı. **Dodaqlarını sallamaq** – b a x **dodağını sallamaq**. [Kosa] *sustalaraq çarpayının yanında dayanmış, əlini qoynuna qoymuş, dodaqlarını sallamış, mat-mat tamaşa edirdi.* S.Rəhimov. **Alt dodağı yer süpürmək** – b a x **dodağı yerlə getmək**. *Xanpəri .. qozaların eyni vaxtda açılmayacağını fikirləşdikcə alt dodağı yer süpürürdü.* Ə.Vəliyev. **Nə dil bilsin, nə dodaq** – b a x **dil**[1].

**DODAQALTI** *zərf* 1. Yavaşcadan, pəsdən, öz-özünə. *Yalnız Mina ilə Xədicə arabir dodaqaltı söylənir, bu qərardan məmnun olmadıqlarını bildirirdi.* A.Şaiq. *Dodaqaltı segah deyən qoca bənnalar; Sal daşlardan təməl qoyur, divar hörürdü.* Ə.Cəmil.

2. İstehza ilə. *Dodaqaltı gülmək nədir, söylə, ya?* M.Ə.Sabir. [Altıaylıq] *dodaqaltı gülə-gülə əlini döşünə qoyub camaata baş əyərdi.* H.Sarabski.

**DODAQARASI** b a x **dodaqaltı**. *Yarməmməd nə isə dodaqarası anlaşılmaz bir şey mızıldadı.* M.İbrahimov.

**DODAQBADODAQ** b a x **ağızbaağız** 1-ci mənada.

**DODAQCIQ** *is.* Kiçik (incə, zərif) dodaq.

**DODAQÇİÇƏKLİLƏR** *is. bot.* Nanə, adaçiçəyi və s.-nin mənsub olduğu bitki fəsiləsinin adı.

**DODAQDƏYMƏZ** *is. ədəb.* Aşıq şeir formalarından biri (bu şeir formalarında sözlər elə seçilir ki, dodaq səsləri, demək olar ki, iştirak etmir). *Aşıq Ələsgərin dodaqdəyməzləri xalq arasında məşhurdur.*

**DODAQLAMA** *sif.* Ağzına qədər dolu; ağızbaağız, ləbələb. *Bir dodaqlama dolça ayran içdi.*

**DODAQLANAN** *f.sif. dilç.* Dodaqlar vasitəsilə tələffüz edilən. *Dodaqlanan səslər*.

**DODAQLANMA** "Dodaqlanmaq"dan *f.is.*

**DODAQLANMAQ** *f. dilç*. Dodaqlar vasitəsilə tələffüz olunmaq.

**DODAQLANMAYAN** *f.sif. dilç*. Dodaqlar vasitəsilə tələffüz edilməyən. *Dodaqlanmayan səslər.*

**DODAQLAŞMA** "Dodaqlaşmaq"dan *f.is.*

**DODAQLAŞMAQ** *qarş*. Dodaq-dodağa öpüşmək.

**DODAQLI** *sif.* Dodağı, dodaqları olan. *Xüsusi yer ayrılıb; sərvboylu, püstə dodaqlı canana.* R.Rza.

**DODAQLIQ** *is*. Nəfəsli musiqi alətlərinin dodaq dayadılan hissəsi; ağızlıq.

**DODAQUCU** *zərf* Ürəksiz, istəmədən, həvəssiz. *Dodaqucu salam vermək. – Zeynəb dodaqucu gülümsəyib Rüstəm kişini süzdü.* M.İbrahimov. *Gülsənəm arvad dodaqucu gülümsədi, gözlərini yerə dikdi, astadan köksünü ötürdü.* M.Hüseyn.

**DODAQVARİ** b a x **dodağabənzər**.

**DODU** *is*. 1. *köhn*. Keçmişdə: çömçə ilə oynanılan gülməli bir oyun.

2. *dan*. Hiylə, kələk, fənd.

◊ **Dodu vermək** *dan*. – başını tovlamaq, yalan vədlərlə aldatmaq. **Dodu gəlmək** – aldatmaq, kələk gəlmək, fənd gəlmək.

**DOĞAN** *f.sif.* Bala verən, övlad verə bilən, qısır olmayan. *Doğan inək. Doğan heyvan. – Yüz min mamaça olsa da, güc doğana düşər.* (Ata. sözü).

**DOĞANAQ** *is*. 1. Bir-birinə bənd etmək üçün örkənin, sicimin ucuna bağlanan ağac haçacıq (qarmaq); örkən halqası. *Örkən nə qədər uzun olsa, yenə gəlib doğanaqdan keçər.* (Məsəl).

2. Aşılanmış dərini yumşaltmaq üçün haçaşəkilli dəmirdən qayrılmış içərisi tiyəli alət. *Aşılanmış dəri doğanaqdan keçməsə, yumşalmaz.*

**DOĞANAQLAMA** "Doğanaqlamaq"dan *f.is.*

**DOĞANAQLAMAQ** *f.* Doğanaq vasitəsilə dərini yumşaltmaq. *Dərini doğanaqlamaqla yumşaldırlar*.

**DOĞAR** *sif.* Əsasən bala vermək üçün saxlanılan, doğan. *Doğar inək. Doğar camış.*

**DOĞDURMA** "Doğdurmaq"dan *f.is.*

**DOĞDURMAQ** "Doğmaq"dan *icb.*

**DOĞMA** 1. "Doğmaq"dan *f.is.*

2. *sif.* Eyni ata və anadan olmuş, bir qarından çıxmış. *Doğma qardaş. – ..Dəstədə olan adamların biri Mirqasımdır ki, doğma bacısı Səkinənin malını yemək qəsdi ilə saxta kağız düzəltmişdi.* C.Məmmədquluzadə. // Ögey olmayan. Doğma bala. *Doğma ata* (*ana*). *– Səhərisi gün Budaq doğma dayısını tapdı və 1921-ci ilə kimi onun yanında qaldı.* Ə.Vəliyev.

3. *sif.* Anadan olduğu, doğulduğu, meydana gəldiyi, həyata gəldiyi (yer və s.). *İndi* [müəllim] *xatırlayırdı ki, şəhərdə nə üçün darıxırdı. Ora ki özünün doğma yurdu idi.* S.Hüseyn. *Gəlir vətən oğlu doğma diyara.* M.Rahim. ☐ **Doğma dil** – ana dili. [Əmir Safiyə xatuna:] *Çünki ərəbcə şeirlər sənin doğma dilində deyildir.* M.S.Ordubadi.

4. *sif.* Ən yaxın, ən əziz, ən mehriban, sevimli. *Silsilə dağlarda axan sellərin; Doğma bir oğluyam, doğma şairi.* A.Şaiq. *Doğma şirin nəğmələrini; Dəyişmərəm bu dünyanın dövlətinə, malına.* N.Rəfibəyli. *O qoxlayır Reyhanının; İsti doğma nəfəsini.* M.Dilbazi.

**DOĞMACA** "Doğma" (2-ci mənada) *söz. oxş*. *Müqəssir kənddə hamının yaxşı tanıdığı Tahirin doğmaca əmisi .. Hümmətəli idi.* M.Hüseyn.

**...doğrayan** Bir sıra sözlərə qoşularaq həmin sözlərlə əlaqədar alət adları düzəldilir, məs.: yemdoğrayan, ətdoğrayan və s.

**DOĞMAQ** *f.* 1. Dünyaya bala gətirmək; balalamaq. *Uşaq doğmaq. Bala doğmaq. – Sənin kimi oğlanı; Analar tək-tək doğar.* (Bayatı). *..Bacım Fatma da hamilə idi və doğmağına bir neçə gün qalanda əri İsmayıl bəy də gəldi İrəvana.* C.Məmmədquluzadə. *Bir il sonra Zeynəb bir oğlan doğdu.* M.İbrahimov.

2. *məc.* Çıxmaq, görünmək, tülu etmək (göy cisimləri haqqında). *Ay doğdu, işıq verdi; Yara yaraşıq verdi*. (Bayatı). *Səhər oldu, ay gizləndi, gün doğdu.* Q.Zakir. [Dursun:] *Səlimqızı, bildirçinlər səhər günəş doğarkən, axşam günəş batarkən oxuyurlar*. C.Cabbarlı. *Bu gecə doğmuş həqiqət günəşi; Parlamış üzlərə zəhmət günəşi*. M.Müşfiq.

3. Meydana çıxmaq, ortaya çıxmaq, əmələ gəlmək, törəmək, irəli gəlmək, nəşət etmək, hasil olmaq. *Qələm tez-tez qələmdandakı davata batırılıb kağızın üzərində dola-*

*şır, sətir-sətir dalınca doğur, qəmli şairin ürəyini yüngülləşdirirdi.* Çəmənzəminli.

4. *köhn*. Doğulmaq.

**DOĞRAM** *is.* Bir dəfə doğramaqdan hasil olan miqdar, yaxud doğranmış, kəsilib parçalara ayrılmış şey. *Bir doğram odun gətir.* □ **Doğram etmək** – b a x **doğram-doğram etmək** (“**doğram-doğram**”da). [Məhbuslar:] *Qurban əti tək ətimizi doğram edəcək; Ləziz təamlar bişirib xalqa verəcək.* Ü.Hacıbəyov.

**doğram-doğram** *zərf* Tikə-tikə, parça-parça. □ **Doğram-doğram etmək** – tikə-tikə doğramaq, tikə-tikə etmək. *Dərisini soymadan* [camışın] *qarnını yardılar, mədəsini, bağırsaqlarını bayıra tökdülər. Hər şeyi doğram-doğram elədilər.* İ.Şıxlı.

**DOĞRAMA** 1. “Doğramaq”dan *f.is.*

2. *is.* İçinə çörək doğranmış süd, qatıq və ya ayrandan hazırlanan duru yemək. *Qatıq doğraması. – Çoban İbrahim Əjdərə çox hörmət eləyib, süd sağıb ona süd doğraması verdi.* (Nağıl). *De görüm, sən darı cadını ayrana doğrayıb yeyəndə, ağa da bir qaşıq götürüb səninlə o doğramadan yeyəcəkdirmi?* Ə.Haqverdiyev.

3. *sif.* Bir boyda, bir ölçüdə, bir bərabərdə bölünmüş (kəsilmiş, doğranmış). *Doğrama tənbəki.* // *is.* Xırda-xırda, bir boyda doğranmış taxta və s.

**DOĞRAMAC** *is.* Xırda-xırda doğranmış çörəklə qatıqdan, ayrandan hazırlanan və çox vaxt xiyar, göyərti və s. qatılan soyuq yemək. *Keşnişli doğramac. Doğramacı süfrəyə soyudulmuş halda verirlər. – Sadıq kişi doğramacın yarıdan çoxunu yeyəndən sonra, aradakı sükutu pozdu.* M.Hüseyn. *Çərkəz arpa çörəyini ovcunda ovxalayıb qatığın içinə tökdü. Ağac qaşıqla qarışdırıb doğramac etdi.* İ.Şıxlı.

**DOĞRAMACLIQ** *sif.* Doğramac üçün yarayan, doğramac üçün olan. *Doğramaclıq göyərti, xiyar.*

**DOĞRAMAÇI** *is. xüs.* Taxta parçalarından qapı, pəncərə, çərçivə kimi şeylər qayıran usta, dülgər.

**DOĞRAMAÇILIQ** *is.* Doğramacının işi, peşəsi, sənəti.

**DOĞRAMAQ** *f.* 1. Doğrayıcı, kəsici alətlə bir şeyi xırda-xırda kəsmək, parça-parça kəsmək; parçalayıb, sındırıb kiçik-kiçik hissələrə ayırmaq. *Odun doğramaq. Qənd doğramaq. – ..Ətyeyən heyvanın, məsələn, pişiyin dişlərinin hamısı iti bıçaq kimidir. Çünki əti doğramaq, yəni kəsmək ilə xırdalamaq olur.* H.Zərdabi. // Bir boyda, bir ölçüdə kəsmək. *Aslanov hələ çörək doğramamış, şorbadan bir-iki qaşıq içib dadına baxdı.* M.Hüseyn. // Ağzı iti bir kəsərti və ya alətlə bir şeyi kəsik-kəsik etmək, tikə-tikə etmək, parçalamaq. [Fərhad] *kəlbətini kəmərindən çıxarıb məftilləri doğramağa başladı.* Ə.Vəliyev. // *məc.* Para-para etmək. *Doğradı qəmzən xədəngi bağrımı, qan eylədi.* Nəsimi. *Doğrayacaq səsim dağda dumanı; Dinləyəcək məni dağın çobanı.* Ə.Cavad. [Etibarın] *göz yaşları Dilaranın həssas ana qəlbini tikə-tikə doğradı.* M.İbrahimov.

2. Bölmələrə, arakəsmələrə ayırmaq. *Taxtanı bölmələrə doğramaq.*

3. *məc. dan.* Laf vurmaq, yalandan vədə vermək mənasında.

**DOĞRANMA** “Doğranmaq”dan *f.is.*

**DOĞRANMAQ** 1. *mach.* Parça-parça kəsilmək, xırda-xırda edilmək, tikə-tikə edilmək. *Odun doğrandı.*

2. *t-siz.* Parça-parça olmaq, tikə-tikə olmaq.

**DOĞRANMIŞ** *f.sif.* Parça-parça kəsilmiş, xırda-xırda (tikə-tikə) edilmiş. *Doğranmış qənd. Doğranmış odun.*

**DOĞRANTI** *top.* Doğranmış, kəsilmiş şeylər; qırıntı; doğramaq nəticəsində hasil olmuş tör-töküntü. [Yunis Səlimova:] *Nədir o? Bir yığın doğrantı tökübsünüz, həyatinizdən keçmək olmur!* Mir Cəlal.

**DOĞRATDIRMA** “Doğratdırmaq”dan *f.is.*

**DOĞRATDIRMAQ** b a x **doğratmaq**.

**DOĞRATMA** “Doğratmaq”dan *f.is.*

**DOĞRATMAQ** *icb.* Bir şeyin xırda-xırda, hissə-hissə, bir boyda, bir ölçüdə kəsdirmək, parçalatmaq. *Odunu doğratmaq. Kartoteka üçün kağız doğratmaq.*

**DOĞRAYICI** *is. xüs.* Bir şeyi doğramaq üçün işlədilən alət və s. // Sif. mənasında. *Bərk süxurları qazımaq üçün doğrayıcı baltalar işlənir.* S.Quliyev.

**DOĞRU**[1] *sif.* 1. Düzgün, düz, haqq. *Doğru yol. Doğru sözə nə demək olar. – Yar yanında günahkaram; Doğru sözüm yalan oldu.* Aşıq Ələsgər. *Bar verməz əkdiklərin, doğru sözümdür, inan; Qatmasan bu torpağa öz alnının tərini.* S.Rüstəm. ☐ **Daha doğrusu** – həqiqətdə, həqiqətən əslində.

2. Təmiz, saf, namuslu, safqəlbli, sədaqətli, doğruçu. *Bu mühəndisi mən insaflı, şərəfli və olduqca doğru bir adam tanıyırdım.* B.Talıblı. [Səlim:] *Mən səni bir doğru qız zənn edərdim; Səndə ki aldatmaq da varmış?* H.Cavid. // *İs. mənasında.* Düzgün adam, düz adam, ürəyi saf adam, səmimi adam. *Daim haqdır Vidadinin deməyi; Doğruların hərgiz itməz əməyi.* M.V.Vidadi.

3. Həqiqi, səhih, gerçək, həqiqətə uyğun, uydurma olmayan. *Doğru hadisə. Doğru məlumat. – Doğru xəbərdir, anın üçün darə düşmüşəm.* Nəsimi. *Bu, nağıl deyil, doğru əhvalatdır.* M.Rzaquluzadə. // *İs. mənasında*. Doğru, düzgün, gerçək, həqiqi söz və s. *Ömründə gəlməyib doğru dilinə.* Q.Zakir. *Yaxşı olur doğru, düzün axırı.* Aşıq Pəri. // Haqlı, ədalətli. *Kim doğrudur? Doğru iş.* – [Uluğ:] *Budur ən doğru və sağlam tədbir; Olsun üç qonşu bu gündən əlbir.* A.Şaiq.

4. Səhvsiz, xatasız, düzgün. *İfadə çox doğru ifadədir. – Zeynal çaldığı kimi oxuyardı da, iddia edərdi ki, çargahı özü kimi düz və doğru* (z.) *oxuyan yoxdur.* S.Hüseyn.

5. Xəbər şəkilçisi ilə: **doğrudur** – 1) düzdür, həqiqətdir. *Doğrudur, o bu gün gedir. – Doğrudur, Mahmud arvadını çox sevirdi və onun misilsiz gözəlliyinə bənd olduğu üçün hər bir günahından keçirdi.* B.Talıblı. *Doğrudur, zərifliyin adı başqadır; Qüvvətə gəl, qüvvətin dadı başqadır.* M.Müşfiq; 2) hərçənd, hərçənd ki. *Doğrudur, kəndlərdə və balaca şəhərlərdə qışın o qədər bir səfası yoxdur, amma Tiflis kimi yerdə qış böyük bir qənimətdir.* C.Məmmədquluzadə. *Doğrudur, naxoşdur Tapdıq, tez tapar lakin şəfa.* C.Cabbarlı. *Doğrudur, Əntiqə anasının son sözünü anlamadı, ancaq soruşmadı.* Mir Cəlal. // Eyni mənada bəzən "ki" bağlayıcısı ilə işlənir. *Doğrudur ki, yaz hər yerdə yaxşı olur.* Mir Cəlal.

**DOĞRU**[2] *qoş*. Yön, tərəf, istiqamət, cəhət bildirir. *Naşı ovçu bərə bəklər, əylənər; Marallar sayrışır yollara doğru.* Qurbani. *Almaz bir sevinclə Fuada doğru atılaraq onu qucumaq istəyir.* C.Cabbarlı. *Günəş üfüqə doğru əyiləndə bu adam artıq Heybət stansiyasından uzaqlarda idi*. S.Rəhman.

**DOĞRUCA** *zərf* 1. Doğru, düz. *Doğruca deyir.*

2. Düzcə, dolaşıqsız, əngəlsiz; bilavasitə, düz, birbaşa. *Bu yol doğruca kəndə gedir.*

**DOĞRUCUL** b a x **doğruçu**.

**DOĞRUCULLUQ** b a x **doğruçuluq**.

**DOĞRUÇU** *sif.* Yalan sevməyən, həmişə düz danışan, düzlük sevən, düzünü deyən, həqiqətçi; həqiqət, düzgün iş tərəfdarı. *Doğruçu adam. – Dövlət o qədər diqqətli və qayğıkeş olmalıdır ki, onun məmurları məhkəmə işlərində fövqəladə ədalətli, doğruçu və haqq tərəfdarı olsunlar.* M.F.Axundzadə. *"Dünyada səbəbsiz bir şey yoxdur", – deyənlər nə qədər doğruçu, nə qədər alicənab şəxslər imiş.* M.S.Ordubadi. // Həqiqi; uydurma, yalançı olmayan. *Sitarə ilk dəfə dünyaya həqiqət nəzəri ilə baxdı: cavan qızın qabağında xəyali məşuqu əvəzində doğruçu əri durmuşdu.* Çəmənzəminli.

**DOĞRUÇULUQ** *is.* Düzlük, həqiqətçilik, namusluluq.

**DOĞRUDAN** *zərf* Həqiqətən, düzünü desək əslində. [Məhəmmədhəsən əmi:] *İzzət, doğrudan pəyədə ağlayan sən idin?* C.Məmmədquluzadə. // Ara söz mənasında (çox vaxt "da" ədatı ilə birlikdə). *Azərşəhr, doğrudan da, Azərbaycanın dilrüba bir guşəsidir.* M.İbrahimov. *Doğrudan da, getdikcə Solmazın yeri görünür, o şux tərlanın səsi eşidilmirdi.* S.Rəhimov.

**doğrudan-doğruya** 1) b a x **doğrudan**. *Amma doğrudan-doğruya Bakıda mən qəbzbazlığı artıq bir şey bilirəm.* C.Məmmədquluzadə; 2) bilavasitə. *Bu iş doğrudan-doğruya sizə aiddir.*

**doğrudan-doğrusu** b a x **doğrusu**.

**DOĞRU-DÜRÜST** *sif.* və *zərf* Düz, düzgün, həqiqi. [Bəy] *elə bilirdi, səndən doğru-dürüst adam yoxdur.* Ə.Haqverdiyev.

**DOĞRULAMAQ** *f.* Təsdiq etmək, "doğrudur" demək, doğruluğunu qəbul etmək.

**DOĞRULANMA** "Doğrulanmaq"dan *f.is.*

**DOĞRULANMAQ** *məch*. Təsdiq edilmək, doğru olduğu aşkara çıxarılmaq.

**DOĞRULMA** "Doğrulmaq"dan *f.is.*

**DOĞRULMAQ** *f.* 1. Düzəlmək, dikəlmək, düz durmaq, dik qalxmaq. *Otel sahibi gürcü Dmitri onun əllərini yaxasından rədd edib itələdi, o, dəhlizin divarına dəyib doğruldu.* M.S.Ordubadi. *Bir nəfər yoldaşı ilə yükü yerbəyer edən gödək, yoğun və çevik bir fəhlə Qüdrəti görüb doğruldu.* M.Hüseyn. // Qalxmaq, ayağa durmaq. *Birdən Sabir doğruldu, bədənində şiddətli bir ağrı hiss edərək üz-gözünü turşutdu.* M.Hüseyn.

2. Yönəlmək, istiqamət almaq, bir tərəfə üz tutub getmək. *Evə tərəf doğrulub getdi.*

3. Həqiqət olmaq, düz çıxmaq, gerçəkləşmək, həyata keçmək. *Ümidlərim doğrulmadı.*

**DOĞRULTMA** "Doğrultmaq"dan *f.is.*

**DOĞRULTMAQ** *f.* 1. Gözlənilən ümidi doğruya çıxarmaq; verilən ada, göstərilən etibara və s.-yə layiq olduğunu göstərmək, sübut etmək, gerçəkləşdirmək. *Göstərilən etimadı doğrultmaq.* // Bəraət qazandırmaq. *Zeynal öz yaramazlıqlarını doğrultmaq üçün mühitlərini ləkələndirməyə çalışan bir qrup adamlara mənsub idi.* S.Hüseyn. *Maya haqqındakı ehkam Pərşanı bərk tutmuşdu. Onu qızların nəzərində doğrultmaq istəyirdi.* M.İbrahimov.

2. Belini dikəltmək, düz saxlamaq, düz qaldırmaq (çox vaxt "özünü" sözü ilə). *Kərim baba özünü bir də doğruldaraq: – Mənim atam da gözəl ovçu idi, – dedi.* A.Şaiq. *Səfər kişi cəld ayağa qalxdı, özünü doğrultdu.* Mir Cəlal.

3. Nişan almaq, tuşlamaq. *Bir daşa söykənib tüfəngimi doğrultdum.* A.Şaiq. // Yönəltmək. *Arabanı yola doğrultmaq.*

4. Əvəzini çıxartmaq (çox vaxt "özünü" sözü ilə). *Qoyulan xərc özünü doğrultdu.*

**DOĞRULUQ** *is.* 1. Düzgünlük, həqiqilik, düzlük; sədaqət, səmimiyyət. *Səy elə, sən də belə insan ol! Doğruluqda bu ada şayan ol!* A.Səhhət. [Vidadi:] *Dünya dəyişilmiş, əhd, vəfa, sədaqət, doğruluq qalmamışdır.* Çəmənzəminli. *Məhəbbət, doğruluq, cəsarət, ürək; Dil açıb danışır hər gül, hər çiçək.* S.Vurğun.

2. Gerçəklik, səhihlik, düzgünlük, həqiqətə uyğunluq. *Sözün doğruluğu. Xəbərin doğruluğu. Cavabın doğruluğu.* – [Hacı Məhəmmədhaşıma:] *Evinizə varid olandan sonra, mənim sözlərimdə doğruluq tapmasan qayıdarsan buraya, mən sənin pulunu özünə qaytararam.* B.Talıblı. *Rüstəm bəy yumşaldı və Cəfərə baxaraq bir az da gülümsündü. Cəfər gümanının doğruluğunu duyub lovğalandı.* Çəmənzəminli.

**DOĞRUSU** *ara s.* Doğrudan əslinə baxanda, düzü. [Hacı Həsən:] *Şeyxəna, doğrusu, mən övladdan yana bədbəxt olmuşam.* C.Məmmədquluzadə. *Baxdıqca bu dağlardakı qartallara heyran; Sakit dura bilmir ürəyim, doğrusu, bir an.* S.Rüstəm. ☐ **Daha doğrusu** – daha dürüst desək, düzünə qalsa. *O mənim otağa daxil olduğumu bilməyir; daha doğrusu, gurultunun şiddətindən ayaqlarımın səsini eşitmirdi.* H.Nəzərli. *Bəli, bizim kənd, daha doğrusu, bizim oba "Səngər" adlanan, meşəli, ormanlı uca dağın ətəyində yerləşir.* S.Rəhimov.

**DOĞRUYABƏNZƏR, DOĞRUYAOXŞAR** *sif.* Həqiqətə yaxın olan, inanıla bilən. *Doğruyabənzər xəbər. Doğruyaoxşar əhvalat.*

**DOĞU** *is.* Gündoğan, günçıxan; gündoğan, günçıxan tərəf. *Doğu tərəfdən külək əsir.*

**DOĞUB-TÖRƏMƏK** *f.* Törəyib artmaq.

**DOĞULMA** "Doğulmaq"dan *f.is.*

**DOĞULMAQ** *f.* 1. Anadan olmaq, dünyaya gəlmək. *Nizami 1141-ci ildə doğulmuşdur. – Tutalım sən o vaxt olmamısan; Anadan, ya ki heç doğulmamısan.* A.Səhhət. *Şad oldum o gün ki, sən doğuldun; Min şükr elədim ki, oğlum oldun.* M.Ə.Sabir.

2. *məc.* Törəmək, meydana gəlmək. *Bir nəğmə ki doğulmuşdur mübarizə surətindən.* R.Rza. *Ümumiyyətlə, "Molla Nəsrəddin" susmağı bacarmırdı, o, etiraz etmək üçün doğulmuşdu.* M.İbrahimov.

**DOĞULUŞ** *is.* 1. Anadan olma, dünyaya gəlmə.

2. *məc.* Meydana gəlmə, törəmə.

**DOĞUM** *is.* Uşaq (bala) dünyaya gəlməsi fizioloji prosesi; doğma, doğulma; doğuş. ☐ **Doğum evi** – doğum zamanı qadınlara

tibbi yardım göstərmək üçün tibb müəssisəsi. *Burada kitabxana, körpələr evi, hələ tikilib istifadəyə verilməmiş doğum evi yerləşirdi.* Ə.Vəliyev.

**DOĞUMQABAĞI** *sif.* Doğum yaxınlaşdığı zaman olan; doğuşqabağı. *Doğumqabağı ağrılar.*

**DOĞURĞAN** *sif.* Çox doğuran, yaxşı döl verən.

**DOĞURMA** "Doğurmaq"dan *f.is.*

**DOĞURMAQ** *f.* 1. Bax **doğuzdurmaq**.

2. *məc.* Törətmək, meydana gətirmək, əmələ gətirmək; törəməsinə, əmələ gəlməsinə səbəb olmaq. *..Elm və sənəti insanların ehtiyacı doğurmuşdur.* M.S.Ordubadi. *Bu bəxtiyar üzlərdə nə nadir yaraşıq var! Sonsuz sevinc doğurar işıqların yanması.* R.Rza. *Nərgiz xanımın kitabxanası isə həkimlər aləmində qibtə doğuran çox zəngin kitabxana idi.* Ə.Məmmədxanlı.

**DOĞUŞ** *is.* 1. Bax **doğum**.

2. Göy cisimlərinin çıxması, üfüqdə görünməsi; tülu. *Günün doğuşu. Ayın doğuşu.* – *Çün gün doğuşu buraxdı tələt; Mən xəstəyə yenə düşdü firqət.* Xətayi. *Bir müəyyən qanun üzrədir həyat; Bir doğuş, bir təkamül, bir inhitat.* A.Səhhət.

**DOĞUŞQABAĞI** bax **doğumqabağı**.

**DOĞUZDURMA** "Doğuzdurmaq"dan *f.is.*

**DOĞUZDURMAQ** *icb.* 1. Doğum zamanı kömək etmək, uşağını tutmaq.

2. Meydana gətirmək, səbəb olmaq, bais olmaq, törətmək, oyatmaq.

**DOĞUZDURULMAQ** *məch*. Meydana gətirilmək, törədilmək. *Ancaq bu günəş öz-özlüyündə doğduğu halda, .. ağ gün günəşi özözünə əmələ gəlmir, zor-güclə, qan-qada ilə doğuzdurulur.* S.Rəhimov.

**DOĞUZMA** "Doğuzmaq"dan *f.is.*

**DOĞUZMAQ** *dan*. bax **doğurmaq**.

**DOXSAN** *say*. 90 sayının adı; 90 rəqəmi; doqquz onluqdan ibarət say. *Doxsan rəqəmi ona bölünür. Şəhərdən doxsan kilometr uzaqda. Doxsan yaşında qoca. Doxsan manat.* – *Bizim kənddə, doxsan igid qayıtmadı; Doxsan ana yola baxdı; doxsan ümid qayıtmadı.* M.Araz.

**DOXSANINCI** Səksən doqquzuncudan sonra gələn sıra sayı. *Doxsanıncı nömrə. Doxsanıncı illər* (bir əsrin 90-cı ilindən 99-cu ilinə qədər olan dövr).

**DOXSANYAŞLI** *sif.* Doxsan yaşı olan, doxsan yaşında. *Doxsanyaşlı qoca.*

**DOK** [*ing.*] Gəmilərin təmir olunduğu karxana. *Üzücü dok.*

**DOKTOR** [*lat.*] 1. Həkim, təbib. *Can doktoru. Uşaq doktoru. Doktor çağırmaq.* – *Dedi: – Yanmış çörək yedim, doktor! Yediyim bir əlavə şey yoxdur.* M.Ə.Sabir. [Rəşid:] *Məlum şeydir ki, kənddə həkim, doktorzad tapılmaz.* T.Ş.Simurq.

2. Doktorluq dissertasiyası müdafiəsi əsasında verilən yüksək elmi dərəcə və bu dərəcəni almış şəxs. *Tarix elmləri doktoru. İncəsənət doktoru.*

**DOKTORÁNT** [*lat.*] Doktorluq dissertasiyası hazırlamaq üçün bir elmi idarəyə təhkim olunmuş alim.

**DOKTORANTLIQ** *is.* 1. Bax **doktorantura**.

2. Doktoranturada olma, elmlər doktorluğuna hazırlanma. *Doktorantlıq dövrü.*

**DOKTORANTÚRA** [*lat.*] Elmlər akademiyalarında yüksək ixtisaslı elmi işçilər – elmlər doktorları hazırlama sistemi.

**DOKTORLUQ** *is.* 1. Həkimlik sənəti, həkimlik ixtisası, həkimin işi, peşəsi; həkimlik, təbiblik. *Doktorluq etmək.*

2. Doktor elmi dərəcəsi. *Doktorluq dissertasiyası.*

**DOKTRÍNA** [*lat.*] Elmi, fəlsəfi və ya siyasi nəzəriyyə, sistem.

**DOQQAZ** *is.* Adətən kənd yerlərində evin, həyətin, bağın və s.-nin hasarında birbirinə keçirilən ağaclardan ibarət sadə qapı. *Doqqaz ağacı.* – [Balaqız:] *Səfioğlu İskəndər gecələr səhərədək sizin doqqazda bayatı çağırır.* Ə.Haqverdiyev.

**DOQQAZÇA** *is.* 1. Doqqaza keçirilən ağac. *Doqqazçanı tax, həyətə mal-qara girməsin.*

2. Balaca doqqaz.

**DOQQAZKƏSMƏ** *is. etnoqr*. Keçmişdə: gəlin köçəndə yolda doqqazın qabağını kəsib xərclik alma adəti.

**DOQQAZLANMA** "Doqqazlanmaq"dan *f.is.*

**DOQQAZLANMAQ** *məch*. Bağlanmaq, kilidlənmək (doqqaz).

**DOQQAZLI** *sif.* Doqqazı olan.

**DOQQUZ** *miqd. s.* Səkkizdən sonra gələn və 9 rəqəmi ilə işarə olunan say və miqdar. *Səkkizdən sonra doqquz gəlir.*

**DOQQUZAYLIQ** *sif.* Doqquz ay davam edən, doqquz ay müddətində olan, əmələ gələn, doqquz ay ömrü olan. *Doqquzaylıq hesabat. Doqquzaylıq uşaq.*

**DOQQUZCA** *say.* Ancaq doqquz. *Doqquzca manat pulum qalıb.*

**DOQQUZDON** *is. bot.* Meşələrdə bitən, park və bağlarda isə əkilən kol bitkisi. *Doqquzdonun oduncağı çox davamlı olur.*

**DOQQUZLUQ** *sif.* Doqquz vahiddən ibarət olan; doqquz xalı olan, 9 rəqəmi ilə işarə olunan. [Cəbi:] *Mən Mehdi bəyin yerinə olsaydım, onluğa vurulanda qaçardım doqquzluğa.* S.S.Axundov. // 9 nömrəli.

◊ **Doqquzluq qoymaq (gəlmək)** – hiylə gəlmək, fənd gəlmək, kələk gəlmək, aldatmaq. *Mənə doqquzluq gəlmə! – İndi mənim əziz günümdə kimə doqquzluq qoyur?* Mir Cəlal.

**DOQQUZMƏRTƏBƏ(Lİ)** *sif.* Doqquz mərtəbəsi olan. *Doqquzmərtəbəli bina.*

**DOQQUZUNCU** *sıra s.* 8-cidən sonra gələn, sırası, dərəcəsi, növbəsi doqquz olan. *Doqquzuncu skamya. Doqquzuncu sıra.*

**DOQQUZYAŞLI** *sif.* Doqquz il yaşı olan, doqquz yaşında. *Doqquzyaşlı qız.*

**DÓQMA** [*yun.*] *kit.* Bütün dövrlər və tarixi şərait üçün dəyişməz bir həqiqət kimi qəbul edilən hökm, müddəa; ehkam.

**DOQMAÇI** *is.* Doqmatizmə mail olan adam; ehkamçı.

**DÓQMAT** [*yun.*] b a x **ehkam**.

**DOQMATÍK** *sif.* [*yun.*] 1. Doqma (ehkam) mahiyyətində olan, doqmaya aid olan.

2. Mücərrəd, abstrakt, sxematik. *Doqmatik izah üsulu.* – [Usta Zeynalın] *dini etiqadı o dərəcədə doqmatik şəkil almışdı ki, atdığı addımına, gördüyü işinə də arxayın deyil*(*di*). M.İbrahimov.

**DOQMATİKLİK** *is.* Doqma (ehkam) mahiyyətində olma. *Şərhin doqmatikliyi.* // Mücərrədlik, abstraktlıq, sxematiklik.

**DOQMATÍZM** [*yun.*] *kit.* Doqmalara (ehkamlara) əsaslanan qeyri-tənqidi təfəkkür; ehkamçılıq.

**DOL** *is. köhn.* Keçmişdə quyudan su, neft (mazut) çəkmək üçün mal dərisindən, yaxud brezentdən və s.-dən tikilən tuluq. *Kəlləçarxdan asılan mazut dolları dar ağacından asılan məhkumlar kimi sallanırdı.* M.S.Ordubadi. *Yaxşı yadımdadır o dol, bağara; Hərlənib neft çəkən gözübağlı at.* M.Rahim. // Ağacdan (taxtadan) və ya dəmirdən qayrılmış vedrə. *Dolla quyudan su çəkmək.* – [Kərəm:] *Yanıqlıyam, su ver, içib gedirəm; Bir cam verin, içim, dol sizin olsun.* “Əsli və Kərəm”.

**DOLA** b a x **dovla**.

**DOLAB**[1] *is.* Evin divarında düzəldilən rəf, şkaf. *Dolabın qarşısında bir boşqabın qırıqları görünürdü.* S.Hüseyn. [Fatma arvad] *gümüş stəkanaltılarını, qaşıqlarını tələsə-tələsə dolabdan çıxarır.* Mir Cəlal. // Ümumiyyətlə, şkaf. *Mən* [xarratı] *kitab dolabımı təmir etmək üçün çağırmışdım.* T.Ş.Simurq. // Qəfəsə. *Dükanın dolabları malla doludur.* – [Student] *birdən-birə ev sahiblərinin qonaq otaqlarında bir dolab kitab olduğunu xatırladı.* Çəmənzəminli.

**DOLAB**[2] *is.* Quyudan su çıxarmağa məxsus çarx. *Su quyusunun dolabı xarab olmuşdur.*

**DOLAB**[3] *is.* Kələk, hiylə, fənd, biclik, dolaşıq iş. □ **Dolab gəlmək** – hiylə gəlmək, aldatmaq, fırıldaq işlətmək. **Dolab qurmaq** – hiylə düzəltmək, kələk qurmaq. **Dolaba düşmək** – hiyləli işə düşmək, dolaşıq işə düşmək. **Dolaba salmaq** – əngələ salmaq, dolaşıq işə salmaq. [Bəhram:] *Ah, özümü nə təhlükəli bir dolaba saldım!* C.Cabbarlı.

**DOLABÇA** *is.* Kiçik dolab (b a x **dolab**[1]).

**DOLABÇI** *sif. dan.* Hiyləgər, fırıldaqçı, kələkbaz, bic.

**DOLABÇILIQ** *is. dan.* Hiyləgərlik, fırıldaqçılıq, kələkbazlıq, biclik.

**DOLABLI** *sif.* Dolabı olan. *Dolablı divar.*

**DOLAQ** *is.* 1. Qılçaya sarılan, yundan və s.-dən toxunma sarğı, yaxud parça zolağı. *Dolaqsız gedən oğlan; Dolaq tamam oldu, gəl.* (Bayatı). *Bir əsgər kəhriz başındakı qarağaca söykənib dolaqlarını bağlayırdı.* Mir Cəlal. // Patava. [Döyüşçünün] *şineli, şalvarının dizləri, dolağı, çəkməsi başdan-başa palçıq içində idi.* Ə.Vəliyev.

2. *xüs.* Dolamağa, sarımağa yarayan hər şey.

**DOLAQARDI** *is. məh*. Biçinçilərin qollarına sarıdıqları sarğı.

**DOLAQLAMA** "Dolaqlamaq"dan *f.is.*

**DOLAQLAMAQ** *f.* Dolaq sarımaq. // Sarımaq.

**DOLAQLANMA** "Dolaqlanmaq"dan *f.is.*

**DOLAQLANMAQ** *məch*. Dolaq sarınmaq. // Sarınmaq.

**DOLAQLI** *sif.* Qılçasına dolaq sarımış. *Dolaqlı əsgər.*

**DOLAQLIQ** *is.* Dolağa yarayan, dolağa yetəcək qədər olan. *Bir dolaqlıq şal parça.*

**DOLAM** *is.* Sarılan bir şeyin hər bir sarğısı, dövrəsi. // Sarılan bir şeyin hər dəfədəki sarılmış miqdarı.

**dolam-dolam** *sif.* Dolama-dolama, əyri-üyrü, dolamalar halında olan. ☐ **Dolam-dolam olmaq** – qıvrılmaq, burum-burum olmaq. *İlan dolam-dolam olub sərçənin balasını udmaq istəyirdi.*

**DOLAMA**[1] 1. "Dolamaq"dan *f.is.*

2. *sif.* Dümdüz olmayan; birbaşa, düz xətlə getməyən, o yana-bu yana burulan, əyri-üyrü, dolanbac. *Dolama yol. Dolama cığır. Dolama küçə. – Qaranlıq küçədən sonra yolumuz dolamadır.* N.Vəzirov. *Dolama yollarla enirkən bəzi yoldaşlarımız vahiməyə düşdü.* S.Rüstəm. *Tiflisin dolama dar küçəsində; Əlində kamança bir aşıq gedir.* M.Rahim. // *is.* Dönüm, dönüş, döngə. *Nəhayət, dağların sərin küləyi əsməyə başladı, artıq şəhərə bir-iki dolama qalırdı.* Çəmənzəminli.

3. *sif.* Burğu şəklində olan, buruq-buruq, vintvari. *Dolama boru. Dolama pilləkən.*

**dolama-dolama** *sif.* Əyri-üyrü, döngələri, dolamaları çox olan, tez-tez o yana-bu yana burulan, dolanbac. *Dolama-dolama yol. – Dolama-dolama daş pilləkənlər; Bir türbə yanına qaldırır bizi.* S.Vurğun. *Onlar danışa-danışa dağın döşündəki dolama-dolama cığırla irəliləyirdilər.* S.Rəhimov.

**DOLAMA**[2] *is.* Dırnaq altının iltihabı və irinləməsi; qılbaş. *Barmağına dolama çıxıb.*

**DOLAMAÇARX** *is.* Quyudan dol və s. vasitəsilə su çəkmək, keçmişdə neft çıxarmaq üçün onun üzərində qurulan sadə, qaldırıcı (çarxlı) qurğu. *Bir çocuq atla dolamaçarxda su çəkirdi.* S.Hüseyn. // Gəmilərdə lövbəri qaldırmaq üçün çarx.

**DOLAMAQ** *f.* 1. Sarımaq, sarıqlamaq. *Dolağı ayağına doladı, çəkməsini geydi.* – [Durna:] *Çay başından gəlirkən saçlarımı əllərinə doladı, kəndin içindən sürüdü.* C.Cabbarlı.

2. *məc. dan.* Tapşırmaq, üzərinə yükləmək, həvalə etmək, öhdəsinə qoymaq. *Bu işi hər adama dolamaq olmaz.*

3. Basmaq, vurmaq mənasında. *Kənd içərisində Nəbigili gülləyə doladılar. Nəbinin dəstəsi qaçıb evlərin dəhlizlərinə doldular.* "Qaçaq Nəbi". *Baxış bəy Camalın baş-gözünü şallağa doladı.* Ə.Abasov.

4. *məc. dan.* Lağa qoymaq, ələ salmaq, sarımaq, masqara etmək (bəzən "ələ", "əlinə", "dilinə", "barmağına" sözləri ilə). [Sərdar:] *Bu nə sözdür, Yusif şah! ..Atamın ərvahı üçün, səni dolamırıq.* A.Şaiq. *Qara oğlan isə gələn qadını açıqdan-açığa dolamağa çalışırdı.* M.Hüseyn. *Bilmirəm, doğrudanmı bu fikirdəsən, ya bizi dolayırsan.* Ə.Sadıq.

**DOLAM-DOLAŞIQ** *sif.* və *zərf* Tamamilə dolaşıq, çox dolaşıq, anlaşılmaz. *Burmabığ rəis boğuq səslə öz qəzasında yaranan mürəkkəb vəziyyətdən dolam-dolaşıq raport verməyə başladı.* S.Rəhimov.

**DOLANACAQ** *is.* Yaşama şəraiti; güzəran, məişət, keçinəcək, yaşayış. *Mirzə Fətəli komediyalarında hər nə yazıbsa, dolanacağımızın eynindən və məişətimizin özvai-əhvalından götürübdür.* F.Köçərli. *Ancaq anam Allah rəhmətinə getdikdən sonra, doğrusu ki, dolanacaq mənim üçün çox çətin olmuşdu.* B.Talıblı. // Həyat, həyat şəraiti, həyat tərzi, yaşayış üsulu, yaşamaq qaydası. [Əsgər:] *Belə, deyirəm ki, bu cürə dolanacağın axırı nə olsun?..* Ü.Hacıbəyov. *Arabaçımız xoşsöhbət idi. Yol uzunu hər bir bildiyi şeydən danışırdı. Danışdıqlarının çoxu kənd dolanacağına və təsərrüfatına aid idi.* T.Ş.Simurq. // Yaşamaq üçün vəsait, mənbə. *Bahadırın atası qədim bəylərdən olub, dolanacağı ancaq mülklərinə bağlı idi.* N.Nərimanov. *Evin dolanacağı ancaq Mirzə Cavadın qələminə bağlı idi.* Ə.Haqverdiyev. *Quldurlarla vuruşandan bir ay sonra*

*Hümmətyar dolanacaq üçün Bakıya gedir.* Ə.Vəliyev.

**DOLANBAC** 1. *sif.* Çox dolaşıq, əyri-üyrü. *Cığır dolanbac yol kimi əyri idi.* M.İbrahimov. *Oğul! – deyə Güllü arvad, dolanbac yollarla yox, öz ana ürəyi ilə duyub-anladığı kimi açıq-açığına sözə başladı.* Ə.Əbülhəsən. // Düz olmayan, əyri, dolaşıq. *Dolanbac iş.*

2. *is. məc.* Çıxmaz, çıxılmaz vəziyyət, çətin vəziyyət. *Bakı dərsləri olmasa, bizim kəndistan dolanbacda qalar.* S.Rəhimov.

**DOLANBACI** *zərf* Düz xətt ilə yox, əyri-üyrü, dolama xətt üzrə. [Kişi] *qaraquş kimi qanad gərib, .. dolanbacı getməyə başladı.* S.Rəhimov.

**DOLANBACLI** *sif.* Dolama, əyri-üyrü, dolanbac olan. *Dəli və azğın dərədən dolanbaclı yollarla hücum edən bulanıq sellərin əkinləri, tikintiləri basmasına, uşaq aparmasına dözməkmi olar?* Mir Cəlal.

**DOLANDIRICI** *is.* Adam aldatmağı özünə peşə etmiş adam; fırıldaqçı, aldadıcı.

**DOLANDIRICILIQ** *is.* Dolandırıcının işi, peşəsi; fırıldaqçılıq.

**DOLANDIRILMA** "Dolandırılmaq"dan *f.is.*

**DOLANDIRILMAQ** *məch.* 1. Hərləndirilmək, fırlandırılmaq.

2. Gəzdirilmək.

**DOLANDIRMA** "Dolandırmaq"dan *f.is.*

**DOLANDIRMAQ** *f.* 1. Hərləndirmək, fırlandırmaq, aylandırmaq, dövr etdirmək. *Çarxı dolandırmaq. – O əllər .. cəhrə dolandırmaqdan, lülə sarımaqdan qabar olub ağaca dönmüşdür!* Ə.Əbülhəsən. // Gəzdirmək. *Uşağı apar, bağda dolandır, gətir. – Qurbanəli bəyin nökəri kəhər atın cilovundan yapışıb, bir az kənarda dolandırırdı.* C.Məmmədquluzadə. // Döndərmək, çevirmək. *Üzünü dolandırıb mənə dedi..* ☐ **Gözünü (gözlərini) dolandırmaq** – b a x **göz**.

2. *dan.* İdarə etmək. *Ölkəni dolandırmaq. İşləri dolandırmaq. – Onu göndərdilər ki, azarlamış müəllimin yerini birtəhər dolandırsın..* Ü.Hacıbəyov. // Yola vermək. *Onu birtəhər dolandır.*

3. Dolanacağını təmin etmək, saxlamaq. *Ailəni dolandırmaq. – Yaz ağzı molla bazardan bir ikicanlı keçi alır ki, südü ilə uşaqlarını dolandırsın.* "M.N.lətif.". [Durna] *ərindən sonra özündən başqa Fərmanı da dolandırmalı olmuşdu.* Ə.Sadıq.

4. *məc.* Aldatmaq, başını tovlamaq. *Hər zaman Zeynal* [Mehribanı] *bir taqım quru və boş vədələr ilə dolandırırdı.* S.Hüseyn.

◊ **Baş(ını) dolandırmaq** – b a x **baş**. **Başda dolandırmaq** – b a x **baş**.

**DOLANIŞ** *is.* 1. Dolanacaq, dolanma tərzi və şəraiti.

2. Dolanma, hərlənmə, dönmə, dövrə vurma, dövr etmə. *Havanı titrədərək iti sürətlə balaca bir təyyarə Təbrizin üstündə hərlənirdi. İkinci dolanışda o nə isə tökdü.* M.İbrahimov.

**DOLANIŞACAQ** *dan.* b a x **dolanacaq**. [İmran:] *Nə vaxtadək bizim dolanışacağımız belə gedəcəkdir?* Ə.Haqverdiyev.

**DOLANIŞIQ** *dan.* b a x **dolanacaq**.

**DOLANMA**[1] "Dolanmaq[1]"dan *f.is.*

**DOLANMA**[2] 1. "Dolanmaq[2]"dan *f.is.*

2. *is.* Həyat, yaşayış; həyat, yaşayış şəraiti. *İkinci günü Ruqiyyə şəhər dolanmasından usandı.* A.Divanbəyoğlu.

**DOLANMAQ**[1] *f.* 1. Bir şeyin ətrafında fırlanmaq, hərlənmək, dövr eləmək, aylanmaq; dövrə vurmaq. *Bu binanın ətrafını on dəqiqəyə dolanmaq olar. – Hüseynağa şeylərin daşınmasını gözləmədən yuxarı çıxıb buruğu dolandı.* M.İbrahimov. *Dörd tərəfimdəki mərzlərlə zəminin dövrəsini dolanırdım.* Ə.Sadıq.

2. *məc.* Dövr etmək. *Rəyimcə dolanmadı bu dövran; Bilməm ki, nədəndurur bəlası.* Əmani. *Bu nə keyfiyyətdir, bu nə macəra; Rəyimcə dolanmaz təqdiri-qəza.* Q.Zakir. // Gəlib keçmək, ötüb keçmək. *Dolandı qış, gəldi bahar; Göllərdə ördək, qaz gördüm.* "Koroğlu". *Saqiya, belə ah-uf etmə; Dolanar bu zəmanə, inşallah.* M.Möcüz.

3. Gəzmək, dolaşmaq. *Gedək bir az dolanaq, qayıdaq. – Bir ay ramazanı mömin müsəlmanlar səhərdən axşamadək kefli kimi dolanırlar.* C.Məmmədquluzadə. [Tapdıq:] *Sitarə, mən on il gəzdim, dolandım iştiyaqında.* C.Cabbarlı.

4. Yaxın gəlmək, bir yerə gəlmək; bir şeyin ətrafında, yaxınlığında gəzmək, görünmək. [Məşədi Əhməd:] *Heç kəs mənim qapıma*

*dolana bilməz.* Ə.Haqverdiyev. [Tağıyev] *çətin günlərdə daima gizlənər və qərargaha dolanmazdı.* M.S.Ordubadi.

5. *məc.* Canlanmaq, daima xatirində, təsəvvüründə olmaq. *Tahirin gözləri dənizə baxır, amma təsəvvüründə yalnız və yalnız Lətifə dolanırdı.* M.Hüseyn. *Gülnaz heç şey görmürdü, bütün üzlər və gözlər, dumanlı bir pərdənin dalında bir-birinə qarışmış kimi gözlərində dolanırdı.* M.İbrahimov.

6. Tədavüldə olmaq. [Məşədi Allahverənin] *hələ bir az bankda, bir az da əllərdə prosent ilə pulları dolanır idi.* N.Nərimanov.

7. Sarılmaq. *Misri qılınc gəlmələri kəsəndə; Bağırsaqlar cəmdəklərə dolana.* "Koroğlu". *İşin şirin yerində çayın suyundan daha soyuq bir şey Eyvaz kişinin sol qoluna dolandı.* Ə.Vəliyev.

8. İlişmək, dolaşmaq. *Yeriyəndə ayaqları bir-birinə dolanır.*

9. Dönmək, çevrilmək, dəyişmək. *İndi bütün iş dolanıb lağ-lağa; Dərs oxudur hər başı fəsli çağa.* M.Ə.Sabir. *Az vəqtdə fikri dəyişib rəyi dolandı.* Ə.Nəzmi.

10. Hərəkət etmək, davranmaq, özünü hər hansı bir tərzdə aparmaq. *Pərviz xan fırıldaq kəlməsindən dilxor olmuşdu. Lakin öz etiqadını pozmayaraq ədəb dairəsində dolanırdı.* M.S.Ordubadi. *Qoca arvad yenə Laçının üzündən öpdü, ehtiyatlı dolanmağı məsləhət görüb getdi.* M.Hüseyn.

11. Yola getmək, yoldaşlıq etmək, keçinmək. *Onlar bir yerdə dolana bilmirlər.*

**DOLANMAQ²** *f.* Öz həyatını, dolanacağını bir vasitə ilə təmin etmək, keçinmək, yaşamaq, güzəran etmək. *O indi çox yaxşı dolanır.* // Ümumiyyətlə, yaşamaq, güzəran keçirmək, həyat sürmək. *Bir növ dolanırdıq, mən palaz toxuyub satardım, o da öz işinə məşğul idi.* N.Vəzirov. *İndi səkkiz il idi ki, muzdur Məşədi Əsgər Qanlıtəpədə bir arvadı və üç baş xırdaca uşaqları ilə ayda iyirmicə manat məvacibə qənaət edib dolanırdı.* S.M.Qənizadə. *Fərhad və Züleyxa balaca Aslanın zəhməti sayəsində dolanırdı.* C.Cabbarlı.

**DOLAŞ¹** b a x **dolaşa**. *Dəyirmanın, bulaqların suyu donmuş, qurumuş; Sərçə, dolaş yem axtarır, qar üstünə qonmuşdur.* A.Səhhət.

**DOLAŞ²** *sif. dan.* Dolaşıq, pırtlaşıq.

**dolaş-dolaş: dolaş-dolaş olmaq** – dolaşmaq, dolaşıq düşmək. *İp dolaş-dolaş olub açılmır.*

**DOLAŞA** *is. zool.* Qarğa cinsindən kiçik qara rəngli quş; zağca. *Dolaşa yuvası. Dolaşanı ələ öyrətmək olur.*

**DOLAŞDIRILMA** "Dolaşdırılmaq"dan *f.is.*

**DOLAŞDIRILMAQ** "Dolaşdırmaq"dan (1, 2, 3, 5 və 6-cı mənalarda) *məch.*

**DOLAŞDIRMA** "Dolaşdırmaq"dan *f.is.*

**DOLAŞDIRMAQ** *f.* 1. Dolaşıq salmaq, qarışdırmaq; pırtlaşdırmaq. *İpi* (*sapı*) *dolaşdırmaq.*

2. Bağlamaq, düymək, dolamaq, bənd etmək, ilişdirmək. *Atın noxtasını ağaca dolaşdırmaq.*

3. *məc.* Hiylə qurub birini bədbəxt etmək, yaxud məsuliyyətə cəlb olunmaq üçün pis bir işə cəlb etmək, şər və böhtan ataraq təqsirləndirilməsinə səbəb olmaq. [İbrahim bəy:] *Bir kərbəlayı Qulam var, əlləm-qəlləm, .. hacını yaman dolaşdırıb.* N.Vəzirov. [Namaz:] *Əlavə, özün bilirsən ki, prokuror səni dolaşdırmağa mahna axtarır.* Ə.Haqverdiyev. *..Vətənim var idi, nə etməli, didərgin saldılar, mən də onu unutdum.. Məni nahaq yerə dolaşdırdılar; durmadım, itkin düşdüm.* A.Divanbəyoğlu. ☐ **Özünü dolaşdırmaq** – özü bilmədən, yaxud bilərəkdən nəticəsi bəlli olmayan bir işdə iştirak etmək. [Məşədi Həsən:] *Bilsə idim, əslən özümü dolaşdırmaz idim.* Ə.Haqverdiyev.

4. Çaşdırmaq, karıxdırmaq, düz yoldan sapdırmaq, sözü döndərib azdırmaq. *Ortaya söz atıb bizi dolaşdırma. – Dolaşdırdı bizi ancaq kəc qəza; Gəldi başımıza böyük bir xəta.* H.K.Sanılı.

5. Məntiqi əlaqəni itirərək, faktları qarışdıraraq söyləmək, mətləbi çaşbaş salmaq; karıxmaq. *Sözünü dolaşdırmaq.* // Qəsdən anlaşılmaz, dolaşıq hala salmaq. *Cinayətdə vaxt uzatmaq başlıca şərtlərdən birisidir. Vaxt uzandıqca cani işləri dolaşdırar..* S.Rəhimov.

6. Güllələri dalbadal, müntəzəm xəzinəyə verməmək, ilişdirmək. *Bu tüfəng həmişə dolaşdırır.*

7. Gəzdirmək. *Məhəmmədhəsən ağa düşündü, təkrar Vaqifin üzünə baxdı. Lakin Vaqifin üzünü görmürdü, düşüncə və əndişələr onu başqa bir aləmdə dolaşdırırdı.* Çəmənzəminli.

**DOLAŞIQ** *sif.* 1. Dolaşmış halda olan, pırtlaşıq, bir-birinə dolaşmış, bir-birinə qarışmış, bir-birinin içinə keçmiş. *Dolaşıq ip* (*sap*). *Dolaşıq saç.*

2. Düz getməyən, əyri-üyrü, dolanbac. *Dolaşıq yol. Dolaşıq küçə.* // *məc.* Çətinliklərlə, maneələrlə dolu; ağır. [Züleyxa] *..həyatın dolaşıq yollarına ayaq basmamışdı.* M.İbrahimov.

3. Anlaşılmayan, aydın olmayan, qarışıq. *Dolaşıq ifadə. Dolaşıq cümlə. – ..Qəlbimdə ağır-ağır dərdlərim, başımda dolaşıq fikirlərim, xəyalım, hərc-mərc gözlərim ulduzlarda, bir müddət yata bilmədim.* A.Divanbəyoğlu.

4. Çox mürəkkəb, aydın olmayan, bəlli olmayan, həlli çətin olan. *Dolaşıq məsələ.* // *İs. mənasında.* Aydın olmayan vəziyyət, qarışıq vəziyyət, çətin vəziyyət, iş və s. *Bir dolaşığım var, düzəldə bilmirəm. – Yox, Şamo! İndiki dolaşıqda onların içinə girməyi bacarmaq, onlara cürətlə hərəkət etməyi başa salmaq lazımdır..* S.Rəhimov.

◊ **Dolaşığa düşmək** – çətinə düşmək. **Dolaşıq düşmək** – dolaşmaq. *Hatəm dayı .. təpələr arasında iplik kimi dolaşıq düşən cığırlara baxırdı.* Mir Cəlal. **Dolaşıq salmaq** – dolaşdırmaq, ayıra bilməmək. *Yazı-pozu bilməyən Leylək beşliyi, onluğu, bir də yeddi manat yarımlığı dolaşıq salıb hesabı itirməkdən qorxdu.* S.Rəhimov.

**DOLAŞIQLI** *sif.* 1. Əyri-üyrü, dolama, dolaşıq. [Sürücü] *dolaşıqlı yolda sürəti artırmağın qorxulu olduğunu sezib açıq deyirdi.* Mir Cəlal.

2. B a x **dolaşıq** 4-cü mənada.

**DOLAŞIQLIQ** *is.* Dolaşıq şeyin halı. *Fikrin dolaşıqlığı. Məsələnin dolaşıqlığı. – İlyas gülünc bir heyrət, qəribə bir dolaşıqlıq içində çaşıb donmuşdu.* Mir Cəlal.

**DOLAŞMA** "Dolaşmaq"dan *f.is.*

**DOLAŞMAQ** *f.* 1. Dolaşıq düşmək, pırtlaşmaq, bir-birinə qarışmaq. *Saçları dolaşdı. İp dolaşıb.*

2. Dolanmaq, sarılmaq, ilişmək. *Hərçəndi oynamaq ona yaraşır; Siyah zülfü qamətinə dolaşır.* Aşıq Hüseyn. *Ayı zənciri ilə ağaca dolaşıb dartınır və bağırırdı.* S.S.Axundov. [Şirzad] *yeridikcə hündür qalxmış qanqal və sirkan kolları qıçına dolaşırdı.* M.İbrahimov.

3. Gəzmək, dolanmaq. *Dolaşdım dünyanı, gəzdim baş-başa; Sənin kimi gözəl görmədim, haşa!* Aşıq Ələsgər. [Cavad bəy:] *Qoy bir az dincəlsin, ovda da dolaşsın, onda Firuz bəyin təbi gələr, yazar.* T.Ş.Simurq. // Uçaraq dövrə vurmaq. *Qartallar göy üzündə dolaşır. – Görürlər təyyarələr göy üzündə dolaşır.* M.Seyidzadə.

4. Yayılmaq, intişar etmək. *Zavodda pulların tapıldığına dair şad bir xəbər dolaşdı.* S.Rəhman. // "Ağızdan-ağıza", "ağızlarda", "dillərdə" sözləri ilə – deyilmək, yayılmaq. [Zeynal:] *..Mənim adım bu vaxtadək dildən-dilə dolaşır.* C.Cabbarlı. [Rzaqulu xanın] *Parisin teatr və sair ədəbiyyat səhnələrində oxuduğu leksiyalar və müəssir xitabələr ağızdan-ağıza dolaşaraq, nəhayət, qəzetlərdə və jurnallarda dərc olunardı.* M.S.Ordubadi.

5. *məc. dan.* Nahaqdan işə düşmək, çətin və çıxılmaz vəziyyətə düşmək.

6. *məc.* Sataşmaq, toxunmaq, öcəşmək. *Ey molla dayı, gəl bu müsəlmanə dolaşma!* Ə.Qəmküsar. *Bəylərə, xana dolaşmaq da zarafatmı məgər?* Ə.Nəzmi.

7. Çaşmaq, karıxmaq, sözünün dalını gətirə bilməmək, qarışdırmaq. *O, sözünün axırında dolaşdı.*

8. Bir sıra sözlərə qoşularaq müxtəlif ifadələr və tərkiblər əmələ gətirir, məs.: əl-ayağa dolaşmaq, ağlı dolaşmaq, dili dolaşmaq.

**DOLAY** *is.* Dağın, təpənin döşündən gedən köndələn və əyri-üyrü, dolama yol; cığır. *Qardaşım! Görürəm dağlardan keçən; Yaşıl dolaylarda ayaq izini.* S.Vurğun. *Uzaq yollardan keçib dolaylardan qalxırıq.* N.Rəfibəyli. // Dolama, döngə. *Şose yolunun dolayları da ən uzaqdan görsənir.* C.Məmmədquluzadə. *Xınalıq kəndinə düz yol olsa, Qubadan 30-35 kilometr məsafədir. Biz əyri dolaylarında maşın yolölçəninin aciz qaldığı bu məsafəni yeddi saatdan artığa gəldik.* R.Rza.

**DOLAYI** 1. Bax **dolama**[1] 2-ci mənada. *..Amma bununla bərabər, bilmirəm, niyə dolayıdan dönəndə ürəyim qırtıldadı.* C.Məmmədquluzadə.

2. Qoşma mənasında: ...görə, ...səbəbi ilə, ...üzündən. *Bir dəfə bir nəfər şəxs dəftərxanaya gəlib katibdən öz kağızından dolayı məlumat istəyir.* Ə.Haqverdiyev. *Qız həyadanmı, yaxud nədən dolayı isə cavab verməz.* R.Əfəndiyev.

◊ **Dolayı yolla** *məc.* – düz-düzünə, bilavasitə deyil, başqa yollarla, başqa vasitə ilə, başqası vasitəsilə. **Dolayısı ilə** – 1) bax **dolayı yolla**. *Mister Tomas, ingilislərə məxsus bir soyuqluqla məsələni dolayısı ilə Həkimülmülkə bildirməyi qərara aldı.* M.İbrahimov; 2) üzündən, səbəbindən, nəticəsində. *Əgər bircə dəqiqə bərk külək əssə və ya bir təsadüf dolayısı ilə ayağı sürüşsə, fəhlə .. dənizə düşəcəkdir.* M.Hüseyn.

**DOLÇA** *is.* Su və başqa maye tökmək üçün aşağısı nisbətən enli və ağız tərəfə doğru getdikcə daralan uzunsov qab. [Gülzar] *başqa bir qoca qadını suya gedən görüncə, gedib dolçasını alır, doldurub gətirir.* C.Cabbarlı. [Əhməd:] *Birdən* [Gülnaz] *başında çadrası olduğunu düşünüb üzünü örtmək istədi, lakin bacarmadı, əlində süd dolçası var idi.* T.Ş.Simurq. *Bəzən Mələk bacı işdən qayıdarkən eyvanda stolun üstündə dəyirmandan yenicə gətirilmiş bir tabaq un, təzə bişirilmiş çörək və ya bir dolça süd görərdi.* Ə.Sadıq.

**DOLDURMA** "Doldurmaq"dan *f.is.*

**DOLDURMAQ** *f.* 1. Boş şeyi dolu etmək, bir şeyin içinə doluncaya qədər şey qoymaq (tökmək), dolu hala gətirmək. *Kisəni unla doldurmaq. Vedrəni su ilə doldurmaq. Topu hava ilə doldurmaq. Anbarı odunla doldurmaq. – Qurban .. küpəni götürüb endi həyətə, arxdan küpəni doldurub gətirdi, ləyənə su tökdü..* C.Məmmədquluzadə. *..İnəkləri sağıb üçqulplu qazanı doldurduq.* A.Divanbəyoğlu. *Diyar kişi çubuğuna tənbəki doldurmağa başladı.* Ə.Məmmədxanlı. // Bir şeyin tərkibinə həddən artıq başqa şeylər daxil etmək. *Məqaləsini sitatlarla doldurmuşdur.* – [Şair Ərəstun:] *..Bu başlıqların altını zəngin şeir misraları ilə doldurmaq lazımdır.* S.Rəhimov. // Bir şeyi bir qabın və s.-nin içinə qoymaq, tökmək. *Paltarları çamadana doldur. Bu almaları yerdən yığıb tabağa doldur.* // Yükləmək, qoymaq. *Dolu kisələri maşına doldurdular. Vaqonları yüklə doldurmaq. – Allaflar çuval-çuval arpa, buğda və saman alıb arabalara doldurur, eşşəklərə yükləyirdilər.* A.Şaiq. // Kütlə halında bir yerə yığmaq, toplamaq, bir yerdə cəmləşdirmək, bir yerə daxil etmək, salmaq. *Qarovulçular adamları kameralara doldurdular.* Mir Cəlal. // *məc.* Yayılmaq, tutmaq, çulğalamaq, bürümək; yayılaraq bürümək. *Duman dərəni doldurmuşdur. Güllərin ətri otağı doldurmuşdur. – Ağlayan arvad-uşağın səsi küçəni doldurmuşdu.* M.S.Ordubadi. *..Quşlar öz keflərində idilər və cəh-cəh ilə min cür nəğmələr oxuyub meşəni sədaları ilə doldurmuşdular.* A.Divanbəyoğlu. // Kütlə halında bir yerə daxil olmaq, doluşmaq, yerlərin hamısını tutmaq. *Tamaşaçılar zalı doldurmuşdular.*

2. Tamamilə yerinə yetirmək, həyata keçirmək, ödəmək. *Planı doldurmaq. – Tahir trestlərinin hamıdan qabaqda getdiyini və bir neçə gün əvvəl illik planı doldurduqlarını söylədi.* M.Hüseyn.

3. Anketin, blankın və s.-nin boş qoyulmuş yerlərinə lazım olan şeyləri yazmaq. *Anket doldurmaq. Poçt blankını doldurmaq.*

4. Tüfəng, tapança və b. odlu silahlara barıt, güllə və s. qoyub atılmağa hazırlamaq. *Şirəli çiynindəki tüfəngi doldurdu..* M.Hüseyn. *İndi tüfəngini doldur, hazır qoy; Özün də diqqətli, ehtiyatlı ol.* M.Rzaquluzadə. *Həmzə ilə Qədir də .. Çayqırağı tərəfi nişan alaraq atır, biri alman topçu tüfəngini, ikincisi isə mauzerini doldurur, boşaldırdılar.* Ə.Əbülhəsən.

5. Dənizə, gölə, bataqlığa və s.-yə daş, torpaq və s. tökməklə quru hala gətirmək, qurutmaq. *Bataqlıqları doldurmaq. Sahilin dayaz yerlərini doldurdular.* // Çuxur bir yerə daş, torpaq və s. töküb onu düzləndirmək. *Çalanı doldurmaq. Xəndəyi doldurmaq. Quyunu doldurmaq.*

6. Əskik olan şeyi tamamlamaq, bir şeyin kəsirini tamam etmək. *Qızın qohum-əqrəbaları hərə bir cürə pay gətirib, qızın cehizində olan nöqsan şeyləri dolduracaqlar.* R.Əfəndiyev.

**DOLDURTMA** "Doldurtmaq"dan *f.is.*

**DOLDURTMAQ** "Doldurmaq"dan *icb.*

**DOLDURUCU** *sif. xüs.* Bir şeyi doldurmaq üçün yarayan. *Doldurucu materiallar.*

**DOLDURULMA** "Doldurulmaq"dan *f.is.*

**DOLDURULMAQ** *məch.* 1. Boş bir şeyin içinə doluncaya qədər şey qoyulmaq (tökülmək), dolu hala gətirilmək. *Kisələr unla dolduruldu. Baklar su ilə dolduruldu.* – [Qəhrəman:] *Özümü torpaq doldurulmuş torbanın arxasına yıxdım.* H.Nəzərli. *Piyalələr yenicə doldurulmuşdu.* M.S.Ordubadi. // Bir şeyin tərkibinə həddən artıq başqa şeylər daxil edilmək. *Əsər mətləbə dəxli olmayan təfərrüatla doldurulmuşdur.* // Yükləmək, qoyulmaq. *Maşınlar taxılla doldurulduqdan sonra yola düşdü.* // Bir yerdə bir şeyin çoxluğunu bildirir. *Otaq papiros tüstüsü ilə doldurulmuşdur.*

2. Tamamilə yerinə yetirilmək, ödənilmək, həyata keçirilmək. *Plan artıqlaması ilə doldurulmuşdur.*

3. Boş qoyulmuş yerlərinə lazımi yazılar yazılmaq. *Anket dolduruldu.*

4. Güllə və s. qoyularaq atış üçün hazır vəziyyətə salınmaq. *Tüfənglər dolduruldu. Toplar dolduruldu.*

5. Daş, torpaq və s. tökülərək düzləndirilmək, ya qurudulmaq. *Çalalar dolduruldu. Sahilin dayaz yerləri dolduruldu. Susuz quyular dolduruldu.*

**DOLĞUN** *sif.* 1. Orta dərəcədə kök, dolu, ətli-canlı. *Dolğun yanaq.* – ..*Şərəf .. qələmə ağaclar kimi şax və nazik bədənli Şirzadı, .. dolğun, qarayağız Qızyetəri içəri buraxdı.* M.İbrahimov. *Katib dolğun, sarısaçlı, ortaboylu bir qız idi.* Ə.Vəliyev. *Batalyon komandiri hündürboylu, irigövdəli, qırx yaşlarında, dolğun bir Mayor idi.* Ə.Məmmədxanlı.

2. Dolmuş, şişmiş, köpmüş.

3. Ağzına qədər doldurulmuş; dolu.

4. Gur, qüvvətli, güclü. *Kəramətin çil, dolu çöhrəsi kimi dolğun da səsi vardı.* Ə.Əbülhəsən.

5. Lazımi dərəcəyə çatmış, kamala yetmiş; yetişmiş, yetkin. *Gəncliyin bəzəkli və dolğun çağı; Bizə ümid verir, bizə can verir.* S.Vurğun. // Hazırlıqlı, təcrübəli, sanballı, hərtərəfli. [Rəşid] *hərtərəfli, dolğun, sanballı bir müəllim idi.* S.Rəhimov.

6. *məc.* Mənalı, zəngin məzmunlu, dərin, hər-tərəfli. *Dolğun məzmun. Dolğun nitq.*

7. Tam, çox, çoxca.

8. *məc.* Çox mütəəssir, ürəyi dolmuş, doluxsunmuş, kövrəlmiş. *Biçarə .. yaşarmış gözlərini Kərbəlayı Məhəmmədə döndərib dolğun səsi ilə: – Eh, Allah mərdimazarın evini yıxsın!* – [dedi] Çəmənzəminli. // Yaşla dolmuş. *Bir aya bənzədi camalı solğun; Bir qıza bənzədi gözləri dolğun.* S.Vurğun.

**DOLĞUNLAŞMA** "Dolğunlaşmaq"dan *f.is.*

**DOLĞUNLAŞMAQ** *f.* 1. Kökəlmək, ətəcana gəlmək. *Səlim daha dolğunlaşırdı.* S.Rəhimov.

2. Yetkinləşmək, kamala yetmək.

3. Daha da mənalı olmaq, məzmunlu olmaq; mənaca, məzmunca zənginləşmək. *Tənqid və satira güclənir, mündəricə getdikcə dolğunlaşır.*

**DOLĞUNLUQ** *is.* 1. Köklük, doluluq.

2. Dolmuş şeyin halı.

3. *məc.* Yetkinlik.

4. *məc.* Mənaca, məzmunca mükəmməllik. *Məzmun dolğunluğu. Əsərin ideyaca dolğunluğu.*

**DOLĞUNMAQ** *f.* Dolğunlaşmaq, yetişmək. *Cavan qız sinni-şəbabətə yetmişdi... Boy ucalıb, köksü dolğunub, simasında da ayrı məlahət görünürdü.* Çəmənzəminli.

**DOLĞUNSİFƏT(Lİ)** *sif.* sifəti dolu, kök; koppuşsifət. [Teymur] *dolğunsifət, enlikürək, bədəncə sağlam, çevik bir oğlandı.* M.Hüseyn.

**DOLĞUNVÜCUD(LU)** bax **dolğun** 1-ci mənada. *Bir az sonra yemək otağına iki tələbə də girdi: biri dolğunvücud, qırmızısifət idi, o biri arıq, ortaboylu idi.* Çəmənzəminli.

**DOLLAR** *is.* [*ing.*] 100 sentə bərabər pul vahidi.

**DOLMA¹** "Dolmaq"dan *f.is.*

**DOLMA²** *is.* Tənək yarpağına və ya kələm yarpağına bükülmüş, döyülmüş ətdən və düyüdən hazırlanan xörək. *Yarpaq dolması. Kələm dolması.* – [Cəbi:] *Aşpazı övrət göndərmişdi bazara, dolma üçün kələm almağa.* Ə.Haqverdiyev. *Arabir plov, yazda da dolma hazırlanırdı.* T.Ş.Simurq. // Ümumiyyətlə, içi

qiymə, düyü və s. ilə doldurulmuş tərəvəzdən hazırlanan xörək. *Badımcan dolması.*

**DOLMAQ** *f.* 1. Bir yerə daxil olub onu doldurmaq, başdan-başa hər yerini tutmaq, boş yer qoymamaq. *Evə adamlar doldu. Otağa soyuq hava doldu. Miniklər gəmiyə doldular. – Sar gəlsin dağa dolsun; Bülbüllər bağa dolsun.* (Bayatı). *Mal-qara kəndə dolub hay-küy salmaqda idi.* Ə.Vəliyev. // Dolu hala gəlmək, ağzına qədər bir şeylə dolu olmaq, boşluq qalmamaq. *Stəkanlar çayla doldu. – Mübahisə azından bir saat çəkdi. Çubuqlar da dolurdular, boşalırdılar.* C.Məmmədquluzadə. *Məktəb həyəti oğlan-qızla dolmuşdu.* Mir Cəlal. *Bir çoxları yığılıb buraya gəldi, ev-eşik adamla doldu.* S.Rəhimov. // Məc. mənada. [Orxan:] *Ah, qəlbimə sanki od-alov dolmuş.* H.Cavid. *Gülsəhər qızlarını görüncə ürəyi fərəhlə doldu.* Ə.Vəliyev. *Əzizin ürəyi atalıq qüruru ilə doldu.* S.Rəhman. *Nəbinin ürəyinə şübhə doldu: "Yəqin ki, bəy Yusifi döyməyə gəlib".* Ə.Abasov.

2. Girmək, daxil olmaq (çoxlu miqdarda). *Qulaqlarıma su doldu. – Qarşıdakı ikitağlı böyük pəncərədən işıq içəri dolurdu.* M.İbrahimov. // Nüfuz etmək. *Gülşad qapını açıb içəri girəndə otaqdakı soyuq bədəninə doldu.* Ə.Vəliyev.

3. Yayılıb hər tərəfi tutmaq, bürümək, örtmək, qaplamaq. *Ətrafa səs doldu.* // Örtülmək, tutulmaq. *Çöllər yuxudan olunca bidar; Min rəng çiçəklə doldu gülzar.* A.Şaiq. *Günəş batandan azca sonra, sinəsi yarıq-yarıq, böyük səhranın üstündəki buludsuz göylər ulduzlarla doldu.* M.İbrahimov. *Təndirin bir tərəfi dolmamış, o biri tərəfdə çörək qızarır, köpürdü.* Mir Cəlal.

4. Kökəlmək, ətə-cana gəlmək. *Ətə dolmaq.*

5. Doluxsunmaq, kövrəlmək, tutulmaq, əhvalı pozulmaq, hiddətlənmək, acıqlanmaq. *O doldu, qaşqabağı qara bulud kimi üstdən aşağı sallandı.* S.Rəhimov.

6. Girmək, çatmaq, yetmək. *Ağabəyim ağa artıq böyüyüb, 14-15 yaşına dolmuşdu.* Çəmənzəminli.

7. Yetişərək şirə hasil etmək, sütülləşmək. *Sünbüllər yavaş-yavaş dolur.*

8. Tamamilə yerinə yetirilmək, ödənilmək, həyata keçirilmək. *Planların hamısı dolmuşdur.*

**DOLMALIQ** *sif.* Dolmaya yarayan. *Dolmalıq ət, yarpaq.*

**DOLMUŞ** *f.sif.* 1. Dolu hala gəlmiş, içində boş yer qalmamış. *Dolmuş qab.*

2. *məc*. Doluxsunmuş.

**DOLU**[1] *sif.* 1. İçərisi boş olmayan, ağzına qədər bir şeylə doldurulmuş, ya dolmuş. *Dolu şüşə. Dolu qab. Dolu hovuz. – Günlərimiz keçəydi qızğın fərəhlər kimi; Dolu qədəhlər kimi.* M.Müşfiq. *Abbas kişi dolu bir heybə hazırlayıb yəhərin qaşına saldı.* Mir Cəlal. *İri ocaqlar üstündə dolu qazanlar buğlanır..* M.Rzaquluzadə.

2. Bir şeyin çoxluğunu, bolluğunu bildirir. *Tamaşaçılarla dolu zal. Mağazalar malla doludur. Bazar meyvə ilə doludur. – Küçə ilə bir gün keçərkən mat və məəttəl qaldım: bir böyük imarət kəndli qadınları ilə ləbələb dolu idi.* C.Məmmədquluzadə. *Evi hər gün axşamadək onun yanına ziyarətə gələnlərlə dolu olur.* Ə.Haqverdiyev. *Barjın göyərtəsi yükdaşıyan adamlarla dolu idi.* M.Rzaquluzadə.

3. *məc.* Bir şeyin güclü təzahürünü bildirir. *Şux səslərlə dolu isti yuvalar; Daşqın çaylar, durğun göllər bizimdir.* A.Şaiq. *Evi dərin bir maraq ilə dolu sükut bürümüşdü.* H.Nəzərli. // Eyni mənada hissiyyat haqqında. [Qızının] *hərgünkü bu təlaş dolu sualını oxumağa ana vərdiş etmişdi.* Ə.Məmmədxanlı.

4. Dolğun, bir qədər kök, ətli-canlı. [Sadığın] *boyu ucadır, mənim boyum alçaqdı, amma mən ondan doluyam.* C.Məmmədquluzadə. [Ağca xanımın] *dolu sifəti çəyirdək kimi qurumuşdu.* Mir Cəlal. *Gülara xanım qırx-qırx iki yaşlarında, ağsifət, dolu bir qadın idi.* S.Rəhman.

5. Barıt, güllə, patron və s. qoyulub atılmağa hazırlanmış. *Dolu tüfəng***.** *– Ayağa çəkilmiş dolu avtomatı boşaltmaq olmazdı.* M.İbrahimov. [Mollayev] *yatanda balışının altında həmişə dolu tapança saxlayırdı.* M.Hüseyn.

6. Dənələri çoxlu, şirəli və sıx olan. *Dolu sünbül. – Fazilov dolu və şüşə kimi şəffaf bir*

*salxım götürüb .. o yan-bu yana çevirdi.* Mir Cəlal.

7. *zərf* Dərindən. [Tapdıq] *dolu bir nəfəs alıb müəllimə tərəf baxdı.* Ə.Vəliyev.

**dolu-dolu** *zərf* Ağzınacan dolu olduğu halda.

**DOLU**$^2$ *is.* Havada donub tökülən yağmur dənələri. *Dolu yağmaq. – Gah dolu tökür, gah gurşad yağır, sel-su bir-birinə qarışır.* S.Rəhimov. *Əvvəl xırda, get-gedə iriləşən dolu yağdı.* M.Rzaquluzadə. ◻ **Dolu vurmaq, dolu döymək** – dolunun zərbindən xarab olmaq, məhv olmaq. *Əkinləri dolu vurdu.* – [Qoca:] *Bağ-bostanı vurdu dolu; Bağlanmışdır həyat yolu.* A.Şaiq. **Dolu kimi** – 1) çox şiddətli və iri damcılarla yağan yağış haqqında; 2) *məc.* çoxluq, şiddət bildirir. *Alnından dolu kimi tər axır. – ..Zeynəb .. o tərəf-bu tərəfə qaçıb qışqırırdı və dağlardan da rəhmsiz quldurların gülləbləri onun üstünə dolu kimi yağırdı.* S.S.Axundov. *..Almaz kimi parıldayan gözlərindən dolu kimi yaş tökülürdü.* M.Hüseyn.

**DOLUB-BOŞALMAQ** *f.* 1. Aramsız surətdə bir şeylə dolmaq və boşalmaq. *Şəhərin arvadları dəstə-dəstə hacının böyük bacısı Pərinin evinə dolub-boşalmaqda idilər.* Haqverdiyev. *Həmin axşam Yunisin evi qonaqlarla dolub-boşaldı.* Mir Cəlal.

2. Dərddən, qəmdən, kədərdən ağlamaq dərəcəsinə gəlmək.

**DOLUBƏDƏN(Lİ)** *sif.* Dolğun, bir qədər kök, ətli-canlı.

**DOLUBUYNUZLULAR** *is. zool.* Buynuzlarının içərisi boş sümükdən ibarət heyvanlar dəstəsi. *Dolubuynuzlular və ya marallar fəsiləsinə aid edilən heyvanların buynuzları başqa quruluşda olur. Onların buynuzları içərisi boş olmayan sümükdən əmələ gəlir.* "Zoologiya".

**DOLUCA** *sif.* Ağzınacan dolu, ləbələb dolu, lap dolu.

**DOLUXMA** "Doluxmaq"dan *f.is.*

**DOLUXMAQ** b a x **doluxsunmaq**. *Aqilin ürəyi həyatın bu canlı romanını dinləmək üçün çırpındı, özü isə duymadan doluxdu.* S.Rəhimov.

**DOLUXSAMAQ** b a x **doluxmaq**.

**DOLUXSUNMA** "Doluxsunmaq"dan *f.is.*

**DOLUXSUNMAQ** *f.* Bir şeydən mütəəssir olaraq gözlərinə yaş dolmaq; ağlamsınmaq, ağlamağı gəlmək. *Bəyim doluxsundu, qələm əlində titrədi, gözlərindən yaşlar axıb yazdığı misraların üstünə səpildi.* Çəmənzəminli. *Qıvrım başın əyilmişdir; Doluxsunmuş qara gözün.* R.Rza. *Rübabə doluxsundu, hirsindən ağladı.* Mir Cəlal.

**DOLULUQ** *is.* 1. Dolu şeyin halı. *Qabın doluluğu.*

2. Köklük, dolğunluq.

**DOLUSİFƏT(Lİ)** *sif.* sifəti dolu, dolğunsifət. *Dolusifət oğlan.*

**DOLUŞ** *is.* Dolma. *Bu qab hər doluşda bir kilo yağ ölçür.*

**DOLUŞMA** "Doluşmaq"dan *f.is.*

**DOLUŞMAQ** *qarş.* Kütləvi halda bir yerə dolmaq, daxil olmaq, girmək, gəlib yığılmaq. *Tamaşaçılar zala doluşdular. – Yaxındakı evlərdən qadınlar, çocuqlar Rizvanın həyətinə doluşmuşdu.* S.Hüseyn. *Məktəblilər dəstədəstə; Doluşdu dərs otağına.* M.Dilbazi. // Yığışmaq, toplaşmaq, cəmləşmək. *Qardaşlar, bu gün bir təzə xəbər eşitmişəm, doluşun başıma, nağıl eləyim.* C.Məmmədquluzadə. *Əksərən .. cibli köynək geyərək belini qayışla bərkitmiş kişilər arabanın yan tərəfinə doluşmuş(du).* M.İbrahimov.

**DOLUVURMA, DOLUDÖYMƏ** *is.* Əkinlərin, bitkilərin dolu vurmaq nəticəsində məhv, ya xarab olması.

**DOLUYANAQ(LI)** *sif.* Yanaqları dolu olan, yanaqları koppuş. *Doluyanaqlı uşaq.*

**DOMB** *təql.* Düşən şeyin çıxardığı səs. *Qab əlindən düşüb domb elədi.*

**DOMBA** *sif.* Adətən "göz" sözü ilə: qabağa çıxmış, irəli çıxmış; dəbərə.. [Leylək Ələmdar:] *Oğlan, müştərin-zadın yoxdu ki? – deyə o, domba gözlərini ətrafına gəzdirdi.* S.Rəhimov. *..Onun tatar gözünə oxşamayan domba gözləri az qala yerindən fırlanıb çıxacaq oldu.* Ə.Əbülhəsən. [Konsul] *çim altından baxan qurbağa kimi iri, domba gözlərini qarovulçuya zilləmişdi.* P.Makulu.

**DOMBAGÖZ(LÜ)** *sif.* Gözləri domba, dəbərəgöz.

**DOMBALAQ** *is.* Başı yerə dirəyib, ayaqlarını başından aşırma; mayallaq. ◻ **Dombalaq aşmaq, dombalaq vurmaq** – mayallaq

aşmaq. [Odabaşı:] *Bir para sarsaq-sursaq kitablarda yazırlar ki, .. yer dombalaq aşır.* Ə.Haqverdiyev.

**DOMBALAQLAMA** "Dombalaqlamaq"-dan *f.is.*

**DOMBALAQLAMAQ** *f.* Dombalaq aşmaq.

**DOMBALAQLANMA** "Dombalaqlanmaq"dan *f.is.*

**DOMBALAQLANMAQ** *f.* Yerə dəyib yuvarlanmaq, dombalaq aşmaq.

**DOMBALAN** *is.* 1. *bot.* Yer altında bitən kartofabənzər göbələk növü; yerdombalanı.

2. Çiban, ur, şiş.

3. B a x **domba**.

**DOMBALANGÖZ(LÜ)** b a x **dombagöz(lü)**.

**DOMBALIQ** *is.* Domba şeyin halı; donqarlıq.

**DOMBALMA** "Dombalmaq"dan *f.is.*

**DOMBALMAQ** *f. dan.* 1. Ayaq üstündə, yaxud dizləri üstündə durub bədənin beldən yuxarı hissəsini aşağı əymək.

2. Köpmək, şişmək, qabarmaq. *Ordun dombalmış, deyəsən, dişin bərk ağrıyır. – Gözləri isə qışqırdıqca, elə bil, daha da dombalır.* Ə.Əbülhəsən.

**DOMBALTMAQ** *icb. dan.* Köpdürmək, qabartmaq. [Uşaqlardan biri:] *Gör Abışla Tosu ordlarını necə dombaldırlar?..* Ə.Abasov.

**DÓMBRA** *is.* [*qaz.*] Gövdəsi üçbucaq, yaxud yarımoval şəklində olan ikisimli qazax xalq musiqi aləti.

**DOMBRAÇI** *is.* Dombra çalan çalğıçı.

**DOMBUL** *is.* Yumru, yuvarlaq, koppuş. *Dombul qız. Dombul əllər.*

**DOMCA** *is.* Balıq, yaxud quş tutmaq üçün dairəvi tordan ibarət ov aləti. *Domca ilə çaylardan balıq tutulur. Domca atmaq* (balıq tutmaq üçün domcanı suya atmaq).

**DOMCA-ÇIRAQ** *is.* Qaranlıq və sis-dumanlı gecələrdə quş ovlamaq üçün ovçuların işlətdiyi domca, çıraq və zəngdən ibarət ov ləvazimatı.

**DOMCALANMA** "Domcalanmaq"dan *f.is.*

**DOMCALAMAQ** *f.* 1. Balığı tutmaq üçün domcanı suya salıb çıxarmaq.

2. Qaranlıq və sis-dumanlı gecələrdə domca ilə qırqovul tutmaq.

3. *məc. zar.* Tutmaq, yaxalamaq.

**DOMCALAMA** "Domcalamaq"dan *f.is.*

**DOMCALANMAQ** *məch.* Domca ilə tutulmaq (balıq, quş).

**DOMİNAT** *is.* [*lat.*] Qeyri-məhdud hakimiyyət rejimi.

**DOMİNİÓN** [*ing.*] Britaniya imperiyasının özünü idarə edən hissəsi (keçmiş müstəmləkəsi).

**DOMİNÓ** [*fr.* əsli *ital.*] Üst tərəfində xallar olan 28 sümük (ya başqa şeydən qayrılmış) daşla oynanılan oyun, habelə bu oyuna məxsus daşlar komplekti. *Domino oynamaq. Domino daşları.*

**DOMİNOÇU** *is.* Domino oynayan adam, domino oyununu çox sevən adam, domino yarışında iştirak edən adam.

**DOMKRÁT** [*alm.*] *tex.* Ağır şeyləri az yuxarı qaldırmaq üçün mexanizm. *Əl domkratı. Avtomobil domkratı.*

**DÓMNA** [*rus.*] *tex.* Dəmir filizini əridib çuqun əldə etmək üçün şaxtalı peç, soba. ☐ **Domna sobası (ocağı, peçi)** – b a x **domna**.

**DÓMRA** [*rus.*] Mandolinaya oxşar rus xalq musiqi aləti.

**DOMUŞMA** "Domuşmaq"dan *f.is.*

**DOMUŞMAQ** *f.* 1. Oturacaq yerə istinad edərək ayaqlarını yığıb oturmaq. // Büzüşüb oturmaq.

2. Dimdiklə bitlənmək. *Toyuqlar domuşur.*

**DOMUŞUQ** *sif.* Büzüşmüş, donuxmuş.

**DON**[1] *is.* Qadınların, habelə kişilərin üstdən geydikləri uzunətəkli, belibüzməli, ya büzməli paltar. [Kişinin] *əynində qara şaldan belibüzməli don vardır.* H.Sarabski. [Qədir:] *Allah qoysa, qulluqda hamısının əvəzi çıxar, arxalıq nədir, sənə lap məxmər don alaram.* Mir Cəlal. // Ümumiyyətlə, paltar, libas, üst geyim. *Sənə ağ don yaraşır, niyə qarə geymisən sən?* S.Ə.Şirvani. *Bərk ayaqda körpəsini ayıraraq döşündən; Mərd analar cəbhələrdə don geyəcək meşindən.* S.Rüstəm. [Nuriyyə:] *İnstitutda oxuduğum zaman rəfiqələrim gündə bir dəst paltar geydikləri halda, mən bütün ili bir donla başa vurdum...* İ.Əfəndiyev. // *məc.* Obrazlı təşbehlərdə, örtü mənasında. [Fitnə:] *..Yaşıl don geyinmiş çayır, dağ, yamac; Bir şənlik məclisi qurmuş hər orman.* A.Şaiq. *Qara də-*

*niz gecənin qara donuna bürünüb yatmışdı.* M.S.Ordubadi. *..Ağ don geyinmiş bu qış .. Dilaranın gözlərində qaraldı.* Ə.Məmmədxanlı. // *məc.* Görkəm, qiyafə, zahiri görünüş. *Bu donda heç kəsi görmədim.*

◊ **Don biçmək** – 1) *məc.* tənbeh etmək, bərk cəzalandırmaq; 2) *məc.* səliqəyə salmaq, sahmana salmaq. *Bu işə bir don biçmək lazımdır;* 3) *məc.* kələk gəlmək, bazı gəlmək, başını tovlamağa çalışmaq. *Sərçəyə bax, qaraquşa don biçər; Mərd igidlər dolu badələr içər.* "Koroğlu". **Don geydirmək (geyindirmək)** – əslində olmayan bir məna, mahiyyət, rəng vermək, bir şəklə salmaq. *Müxtəsər, yenə nə qədər düşündümsə, bu suallara müsbət bir don geydirməyi bacarmadım.* M.S.Ordubadi. *Muxtar Zeynalov danışığına siyasi don geyindirdi.* Ə.Vəliyev. **Dona (min dona) girmək** – əsil mahiyyətini gizlətmək, yaxud bir məqsədə çatmaq üçün özünü başqa cür göstərmək, başqa cür qələmə vermək, cilddən-cildə girmək, uyğunlaşmaq. [Hacı Rəcəbəli:] *Qorxma, Həpo bir nadürüstdür ki, hər sifətə və hər dona girə bilir.* M.F.Axundzadə. *Həyat bizə nələr deyir: düşmən girir min dona; Bəzən durur quzu kimi, bəzən dönür quzğuna.* S.Vurğun. **Dona salmaq** – b a x **don geydirmək**. **...donuna girmək** – özünü .. kimi göstərmək (qələmə vermək), .. cildinə girmək. *Hər birimiz guya din və millətin ən qeyrətli hamisi, canıyananı donuna girib zəmanə aslanı, qəhrəmanı oluruq.* C.Məmmədquluzadə. [Pəri Cadu:] *Gərək qaranquş donuna girib uçub, harada olsa tapıb göndərəsən.* Ə.Haqverdiyev. **Donunu dəyişmək** – 1) məqsədinə çatmaq üçün ayrı cildə girmək, başqa cür hiyləli tədbirlərdən istifadə etmək; 2) şəklini, görünüşünü, vəziyyətini dəyişdirmək. *Təbiət qışda öz donunu dəyişdirir. – Bu gün dəyişdirir donunu dövran; Dünya göz açmayır qasırğalardan.* S.Vurğun.

**DON²** *is.* 1. Havanın sıfırdan aşağı dərəcəsi, şaxta. ☐ **Don aparmaq** – donun təsirindən, şaxtadan zədələnmək, yaxud keyimək. *Ayağını don aparmaq.* **Don kəsmək** – dondurmaq dərəcəsində şiddətli təsir etmək; bərk üşümək, soyuqdan donmaq. *Səhərə qədər bədənimi don kəsdi.* // Şaxtalı, çox soyuq. *Qaranlıq və don bir gecə idi.* A.Şaiq. **Don vurmaq** – bərk şaxtadan xarab olmaq.

2. Bərk soyuqdan müvəqqətən buz halına keçmiş su və başqa mayelər; buz. *Donu açılmaq* (buz halında olan mayenin əriməyə başlaması).

◊ **Dona qalmaq** – təəccübdən donub qalmaq, mat qalmaq, çaşmaq. *Gəray bəy gözünü zilləyib ona; Varlığı daş kimi, qalmışdır dona.* S.Vurğun.

**DONANMA** *is.* 1. Ölkənin, yaxud ayrıca bir dənizin, çay hövzəsinin hərb və ya ticarət gəmilərinin hamısı; flot. *Hərbi dəniz donanması. Qara dəniz donanması. Ticarət donanması.*

2. Böyük hərb gəmiləri dəstəsi.

◊ **Hava donanması** – təyyarələrin, uçucu aparatların məcmusu.

**DONANMAÇI** *is.* Donanmada qulluq edən adam; donanma xidmətçisi.

**DONATDIRMA** "Donatdırmaq"dan *f.is.*

**DONATDIRMAQ** *icb. məh.* Bəzətmək (işıqlarla, bayraqlarla və s. ilə). *Toyda bağ və bağçanı donatdırmışlar.*

**DONATMA** "Donatmaq"dan *f.is.*

**DONATMAQ** *f. məh.* Bəzəmək (işıqlarla, bayraqlarla və s. ilə).

**DONDURMA¹** 1. "Dondurmaq"dan *f.is.*

2. *sif.* Dondurulmuş və ya buza qoyulmuş, buzda saxlanmış. *Dondurma ət. Dondurma şərbət.*

3. *is.* Don olan vaxt, ayaz, şaxta, soyuq hava. *Dondurmada sulanan yerlər.*

◊ **Dondurma şumu** *k.t.* – yazda taxıl əkmək üçün payızda şumlanıb qarın altında qalan əkin yeri, habelə bu prosesin özü. .. *birisi təklif edirdi ki, dondurma şumu ilə qış aratını vaxtında eləmək işin əsasını görməyə bərabərdir.* Ə.Vəliyev. *Bir qayda olaraq, tarlanın səthi payızda, dondurma şumundan əvvəl hamarlanır.*

**DONDURMA²** *is.* Dondurulmuş süd (qaymaq), şəkər, meyvə şirəsi və s. qatışığından hazırlanan şirin yemək; morojna. *Südlü dondurma. Şokoladlı dondurma. – Bir qədər oynadıqdan sonra, Mirzağa Cəmiləni yanına alaraq bufetə aparmış, onu dondurmaya qonaq eləmişdi.* S.Hüseyn.

**DONDURMAÇI** *is.* Dondurma hazırlayan və ya satan adam; morojnaçı.

**DONDURMAÇILIQ** *is.* Dondurmaçının işi, peşəsi, sənəti.

**DONDURMAQ** *f.* 1. Soyuğun təsiri ilə buz halına salmaq. *Suyu dondurmaq. Şaxtalar çayları dondurmuşdur. – Cavad yoldaşları ilə birlikdə damarlarda qanı donduran soyuqlara sinə gərərək, həmişə məqsədə, hədəfə doğru irəliləyir.* Ə.Vəliyev. // Maye halından bərk hala keçirmək, qatılaşdırmaq. *Yağı əritdikdən sonra sərinə qoyub dondurmaq.*

2. Çox üşütmək, çox soyutmaq, soyuqda saxlamaq. *Bizi soyuqdan dondurdunuz.*

3. *məc.* Mat qoymaq, heyrət içində qoymaq. *Gözləmədiyi bir səs* [Xəlili] *yerindəcə dondurdu.* P.Makulu.

**DONDURMASATAN** *is.* Bir yerdə durub, ya gəzdirməklə dondurma satan adam; morojnasatan.

**DONDURUCU** *sif.* 1. Donduran, donmuş hala salan.

2. Son dərəcə soyuq, şaxtalı. *..Şiddətli dondurucu ruzgarlarla boğuşaraq işçi bir qadın mənzilinə qayıdırdı.* S.S.Axundov. *Qışın dondurucu bir günü idi. Soyuq qılınc kimi kəsirdi.* A.Şaiq.

**DONDURULMA** "Dondurulmaq"dan *f.is.*

**DONDURULMAQ** *məch.* Soyuğun təsiri ilə buz halına salınmaq. // Maye halından bərk hala salınmaq.

**DONDURULMUŞ** *f.sif.* Buz halına salınmış. // Soyuğun təsiri ilə donuq hala gətirilmiş. *Dondurulmuş balıq* (*ət*).

**DON JUÁN** [bəzi Qərbi Avropa ədəbi əsərlərinin qəhrəmanı Don Juanın adından] Aşiqanə macəralar düşkünü; arvadbaz, qadın düşkünü.

**DONJUANLIQ** *is.* Don Juana xas olan sifət; arvadbazlıq, qadın düşkünlüyü. [Aslanov:] *Mollayevin donjuanlığını mən çoxdan bilirəm!* M.Hüseyn.

**DON KİXÓT** [ispan yazıçısı Servantesin məşhur romanının qəhrəmanı Don Kixotun adından] Qeyri-real, həyata keçirilə bilməyən ideallar uğrunda səmərəsiz mübarizə aparan sadədil xəyalpərəst.

**DONKİXOTLUQ** *is.* Don Kixota xas olan hərəkət; səmərəsiz xəyalpərəstlik.

**DONQA** 1. *sif.* Bax **donqar** 1-ci mənada. *Donqar adam. – Bünyad .. donqa belini güclə sürüyürmüş kimi yavaş-yavaş yeriyən caninin ardınca baxdı.* Ə.Əbülhəsən.

2. *is.* İnsan və ya heyvan bədəninin arxa tərəfində və ya başqa bir yerində çıxıntı. *Dəvənin donqaları.*

**DONQABEL** *sif.* Donqar, qozbel.

**DONQALAMA** "Donqalamaq"dan *f.is.*

**DONQALAMAQ** *f.* Belini donqa hala salmaq, bükmək. *Səsə-küyə gəlib çıxan Qızqayıt qarı belini donqalayıb başını yırğalayırdı.* S.Rəhimov.

**DONQALI** *sif.* Donqası olan. *Sadığın donqalı beli, ətli boynu, ensiz kürəyi .. Xanpəriyə çoxdan tanış idisə də, bugünkü kimi aydın və aşkar görünməmişdi.* Ə.Vəliyev.

**DONQAR** *sif.* 1. Belində donqa olan; qozbel. *O donqar* [kişi] *.. çıxıb poçta tərəf yönəldiyi vaxt Həmid dayıya rast gəldi.* Ə.Əbülhəsən.

2. Bax **donqa** 2-ci mənada.

**DONQARBEL** bax **donqar** 1-ci mənada.

**DONQARBURUN(LU)** *sif.* Burnunun üstü qalxıq olan, burnunun üstündə çıxıntı olan. *..O, sallaqbığlı, donqarburunlu, uzunboylu, arıq bir kişi idi.* M.Hüseyn.

**DONQARLAMA** "Donqarlamaq"dan *f.is.*

**DONQARLAMAQ** *f.* Donqar hala salmaq, donqar kimi etmək; donqar kimi göstərmək.

**DONQARLANMA** "Donqarlanmaq"dan *f.is.*

**DONQARLANMAQ** *f.* Belini əymək, donqar kimi olmaq.

**DONQARLAŞMA** "Donqarlaşmaq"dan *f.is.*

**DONQARLAŞMAQ** *f.* Donqar hala gəlmək, qozbel olmaq, belində donqar (qoz) əmələ gəlmək.

**DONQARLI** bax **donqalı**.

**DONQARLIQ** *is.* Qozbellik. *Oturaq və hərəkətsiz həyat tərzi keçirdikdə bədənin forması dəyişir. Qarın qabağa çıxır, döş yastı və ya basıq olur, bel bükülür, yəni donqarlıq əmələ gəlir.* Ə.Babayev.

**DONQAZ** *sif. dan.* Arıq, sümükləri çıxmış. *Donqaz adam. Donqaz heyvan.*

**DONQAZLIQ** *is. dan.* Donqaz adamın (heyvanın) halı.

**DONQULDAMA** "Donquldamaq"dan *f.is.*

**DONQULDAMAQ** *f.* Narazı halda öz-özünə, yavaşcadan anlaşılmaz sözlər söyləmək; deyinmək.

**DONQULDANMA** "Donquldanmaq"dan *f.is.*

**DONQULDANMAQ** *f.* 1. Narazı halda öz-özünə, yavaşcadan anlaşılmaz sözlər danışmaq; deyinmək, narazılıq izhar etmək. *..O arvaddan həzər etmək ki, sübhdən-axşamacan dodağının altında həmişə donquldana.* N.Vəzirov. *Allahqulu donquldana-donquldana* (z.) *qapıdan çıxdı.* Çəmənzəminli. // *məc. kin.* Ala-babat, pis danışmaq mənasında. *Modabaz və meşşan qadınlardan bəhs edən ədib deyir ki, əlbəttə, belə anaların tərbiyə etdiyi uşaqlar .. firəngcə donquldanacaqlar.* M.Arif.

2. Heyvanlar haqqında: hirslənmə əlaməti olaraq yavaşcadan acıqlı səslər çıxarmaq; mırıldanmaq. *Qaraca qız özünü mağaranın dar yerinə yetirdi. Ayı isə dar yerə soxula bilmədi. Bir az donquldanıb mağaranın ağzında yatdı.* S.S.Axundov.

**DONQULDAŞMA** "Donquldaşmaq"dan *f.is.*

**DONQULDAŞMAQ** *qarş.* Yerbəyerindən donquldanmaq, hamı birdən donquldanmaq.

**DONQULDATMA** "Donquldatmaq"dan *f.is.*

**DONQULDATMAQ** *icb.* Donquldamağa məcbur etmək, donquldamasına səbəb olmaq.

**DONQULTU** *is.* Yavaşcadan, anlaşılmaz halda öz-özünə danışma. // Anlaşılmaz sözlər.

**DONLU** *sif.* Əynində donu olan, əyninə don geymiş; paltarlı, qiyafəli. // *məc.* Obrazlı təşbehlərdə: örtülü mənasında.

**DONLUQ**[1] 1. *sif.* Dona yarayan, paltarlıq. *Donluq parça.*

2. *is.* Dona (paltara) yarayan parça; paltarlıq. *6 metr donluq aldım. – Şəhərin tüccarı və alış-veriş adamları qaydanı gərək pozmasınlar. Qalabəyinin arvadına və qızına təzə çıxan parçalardan donluq göndərsinlər.* F.Köçərli. // Don, paltar. *Xidmətçi əllərini donluğu ilə ovalayaraq: – Hər şey, – deyə masa üzərində qoyulmuş yemək siyahısını ona doğru uzatdı.* A.Şaiq.

**DONLUQ**[2] *is. dan.* Maaş, əmək haqqı, aylıq. [Tükəzban təlimatçıya:] *Bir yaxşı donluq da vermirsiniz ki, ata verdiyim arpasamanın pulu çıxsın, barı..* B.Talıblı. *Bir tək donluq ilə mirzə yazıq özünümü saxlasın, yoxsa pul göndərib bir bölük külfətini dolandırsın?* S.Rəhimov.

**DONMA** 1. "Donmaq"dan *f.is.*

2. B a x **donvurma**.

◊ **Donma nöqtəsi** – (termometrin şkalasında 0 dərəcəsini, yəni suyun donma temperaturunu göstərən qeyd).

**DONMAQ** *f.* 1. Soyuğun, şaxtanın təsirindən, şiddətindən buza çevrilmək, buz halına gəlmək. *Su dondu. – Nə səbəbə su qaynayanda buğ olur, niyə donanda bərkiyir?* C.Məmmədquluzadə. // Buzla örtülmək. *Çaylar donmuşdur. Göl donmuşdur. Pəncərələr donub. – Hələ deyirlər ki, dənizin suyu sahildən xeyli uzaqlara qədər donub.* M.Rzaquluzadə. *Ətrafda nə varsa donub.* Ə.Məmmədxanlı.

2. Dondan, şaxtadan məhv olmaq, tələf olmaq, xarab olmaq, don vurmaq. *Quşlar şaxtadan donmuşdur. Az qala donmuşdum. Ağaclarda qalan meyvələrin hamısı dondu.* // Bərk üşümək, bədəni soyuqdan keyləşmək. *Sərnişinlər maşında soyuqdan donurdular. Barmaqlarım donur.*

3. Maye halından bərk hala keçmək; qatılaşmaq. *Ərimiş mum 25 dərəcə istidə donur. Yağ donmuşdur.*

4. *məc.* Hər hansı bir hiss və ya təəssüratın təsiri ilə bir anlıq sərbəst hərəkət qabiliyyətini itirmək. *Ayını görəndə qorxusundan dondu. – Fitnə birinci beyti oxuyarkən Bəhram donur.* A.Şaiq. [Qız] *məni görüncə boğanaq kimi donub, yaşmağı ağzına çəkib, qönçə dəhanı gizlətdi*. A.Divanbəyoğlu. ☐ **Donub qalmaq** – 1) mat qalmaq, heyrət içində qalmaq, çox təəccüb etmək (bəzən "yerində", "yerindəcə" sözləri ilə). *Bu işə donub qaldım.* [Şahinin] *..yanında yad bir adamın dayandığını gördük, donub qaldıq.* S.Rəhman. *Hamısı qorxusundan saralmış və yerindəcə donub qalmışdı.* M.İbrahimov; 2) inkişaf etməmək, bir nöqtədə durub qalmaq, irəliləməmək, tərəqqi etməmək, hərəkətsiz qalmaq.

**DONMUŞ** *f.sif.* 1. Buz halına gəlmiş, buz olmuş. *Donmuş su.* // Donuq hala gəlmiş,

soyuğun təsirinə məruz qalmış. *Donmuş ət. Donmuş meyvə.* // Buzla örtülmüş. *Donmuş göl. Donmuş pəncərə. – Hələ xatirimdən heç getməmişdir; Donmuş çay üstündə seyrə çıxdığım.* M.Rahim.

2. Soyuğun təsirindən bərkləşmiş, qəliz (qatı) hala gəlmiş, kəsifləşmiş. *Donmuş yağ.*

**DONOR** [*fr.*] Yaralılara və xəstələrə vurmaq üçün öz qanını verən adam. *Biz dünən yazıldıq qırmızı donor; Bu gün yüz qat çoxdur, bax, yazılanlar!* R.Rza.

**DONORLUQ** *is.* Yaralılara və xəstələrə vurmaq üçün öz qanını vermə.

**DONÓS** [*rus.*] *nifr. dan.* Birisi haqqında hökumət idarələrinə və ya onun nümayəndələrinə gizli olaraq verilən məlumat, xəbər. [Hatəmxan ağa:] *Səndən sərdarın xud özünə elə bir möhkəm donos verdirərəm ki, səni birbaş Sibirə itirsinlər.* Ə.Haqverdiyev. *Müsəlmanların bədxahları hökumətə donos veriblər ki, .. dağ kəndlərində müsəlmanlar çoxluca tüfəng və azuqə yığıblar.* C.Məmmədquluzadə. *Qardaşın özü donos verib tutdurduğu qardaşının kağızını elə indicə oxumamışdımı?* Ə.Əbülhəsən.

**DONOSBAZ** *is.* [*rus.* donos və *fars.* ...baz] *nifr. dan.* Adamlar haqqında hökumət orqanları və ya nümayəndələrinə gizli material və ya xəbər verməyi özünə peşə etmiş adam. *Qeyrətli donosbazlarımız iş bacararkən; Tənbəl, dəli şeytanları neylərdin, ilahi!?* M.Ə.Sabir.

**DONOSBAZLIQ** *is. nifr., dan.* Donosçuluq, xəbərçilik, şeytançılıq. [İvan bəy:] *Hər halda, donos, donosbazlıq yaxşı peşə deyil.* N.Vəzirov. [Rza bəy:] *Mən tələb elədim ki, donosbazlıq eləyənləri işdən çıxartsın.* Ə.Vəliyev.

**DONOSÇU** *sif.* və *is.* Donos verməklə məşğul olan (adam); xəbərçi.

**DONOSÇULUQ** b a x **donosbazlıq**. *Donosçuluq etmək.*

**DONSUZ** *sif.* Əynində donu olmayan; paltarsız, geyimsiz. *Mənsiz kətan, kəndir verməz zəmilər; Çadırsız, yelkənsiz qalar gəmilər; Nazik donsuz yayda uşaqlar ağlar.* A.Səhhət.

**DONUXDURMA** "Donuxdurmaq"dan *f.is.*

**DONUXDURMAQ** *f.* Mat qoymaq, heyrət içində qoymaq; çaşdırmaq.

**DONUXMA** "Donuxmaq"dan *f.is.*

**DONUXMAQ** b a x **donmaq** 4-cü mənada. *Arvad donuxmuş: – A kişi, dəli olmamısan, çörək nədir? De görüm, yoxsa qardaşlarımın başına bir şey gəlib?* Çəmənzəminli. *Rəhim bəy təəccüblə donuxdu.* M.Hüseyn. ☐ **Donuxub qalmaq** – b a x **donub qalmaq** 1-ci mənada (**"donmaq"**da). *Elə ki Mələkxatın gördü, qızlar donuxub qalıblar, dedi: – Nə olub, niyə gəlmirsiniz?* (Nağıl). *Rəmziyyə donuxub qalmışdı, anası nə üçün belə edirdi?* S.Hüseyn.

**DONUQ** *sif.* 1. Donmuş, buzlaşmış, buz bağlamış. // Bərk üşümüş.

2. Üstü donmuş kimi, tutqun, dumanlı; parıltısı, işıltısı olmayan, şəffaf olmayan, cilasız. *Donuq şüşə. Lampanın donuq işığı. – Ay yorğun və solğun çöhrəsi ilə buludların arasında gah batır, gah çıxır, parlaq və donuq bir ziya saçırdı.* Ə.Vəliyev.

3. *məc.* Göy, hissiz, duyğusuz, quru, ölgün. *İki dizi üzərində dikələrək donuq və şübhəli baxışlarla məni süzdü.* A.Şaiq. *Eşqsiz yaşayan donuq bir insan; İçini qurd yemiş boş bir ağacdır.* S.Vurğun.

4. *məc.* Hərəkətsiz, inkişafsız, tərəqqisiz bir vəziyyətdə qalan. *Əsərdə həyatı donuq bir vəziyyətdə saxlayan ictimai münasibətlər tənqid edilir.*

**DONUQLAŞMA** "Donuqlaşmaq"dan *f.is.*

**DONUQLAŞMAQ** *f.* Donuq hala düşmək; parlaqlığı, şəffaflığı, parıltısı, cilası getmək.

**DONUQLUQ** *is.* 1. Donuq şeyin halı.

2. *məc.* Süstlük, soyuqluq, hərəkətsizlik, ruh düşkünlüyü. *Əbil Qənbərovun çıxışı .. adamlarda nə isə bir donuqluq əmələ gətirdi.* Ə.Vəliyev. // *məc.* Sakitlik.

**DONUŞLUQ** *is.* Torpağın donmuş halda olması. *Qışda daha soyuq və qar örtüyü az olan Şərqi Sibirdə donmanın dərinliyi bir neçə metrə çatır. Belə şəraitdə torpaq yay zamanı üst tərəfdən əriyə bilir, dərinlikdə isə həmişə donma qatı qalır ki, bu, daimi donuşluq adlanır.*

**DONUŞMA** "Donuşmaq"dan *f.is.*

**DONUŞMAQ** *f.* Azca donmaq, donan kimi olmaq, mayeliyini itirmək. *Çox soyuqdur çı-*

*xan ahəstəcə tək-tək nəfəsi; Bədənində donuşub, laxtalanıb qan, ölüb... ə!* M.Ə.Sabir. // Keyimək.

**DONUZ** *is.* 1. Vəhşi və əhli növləri olan irigövdəli, qısaayaqlı, qoşadırnaqlı, məməli ətlik heyvan. *Donuz əti. – Donuzdan bir tük çəkmək də qənimətdir.* (Məsəl).

2. *məc.* Çox pinti, çirkin, səliqəsiz adam haqqında. // *məc.* Qanmaz, anlamaz, kobud adam haqqında (bəzən söyüş yerində).

**DONUZABAXAN** b a x **donuzçu**.

**DONUZANQURDU** b a x **dozanqurdu**.

**DONUZÇU** *is.* Donuz saxlayan, donuz otaran, donuzlara baxan (adam).

**DONUZÇULUQ** *is.* Kənd təsərrüfatının bir sahəsi olaraq donuz yetişdirmə işi. *Donuzçuluq təsərrüfatı.*

**DONUZQILICI** *is. bot.* Sucuq yerlərdə bitən, bənövşəyi çiçəkli, uzun, şiş yarpaqlı bir bitki.

**DONUZLUQ** *is.* 1. Donuz saxlanılan yer.

2. *məc.* Çirkinlik, natəmizlik, pintilik.

3. *məc.* Qabalıq, qanmazlıq; nankorluq.

**DONUZOTARAN** *is.* Donuz çobanı.

**DONVURMA** *is.* Donun şiddətindən bədənin bir yerində əmələ gələn zədə, xəstəlik hal.

**DOPDOĞRU** *sif.* və *zərf* 1. Tamamilə doğru, tam düzgün. *Dopdoğru söz. Dopdoğru xəbər. Dopdoğru söyləmək. Dopdoğru deyir. – "Acı olur doğru söz" – babalar deyib bunu; Çox görmüşəm bu fikrin dopdoğru olduğunu.* R.Rza.

2. Birbaşa, düz, dümdüz, bilavasitə. *Dopdoğru getdik.*

**DOPDOLU** *sif.* Tamam dolu, ağzınacan dolu. *Dopdolu qab. – İnci təki dişlər dəhənində nəyə bənzər; Bir qönçeyi-xəndanə, içi dopdolu jalə.* Kişvəri. *Sısqa, çalışqan Camal; Arxada bir zor çuval; Şeylər ilə dopdolu; Çox da uzaqdı yolu.* Ə.Nəzmi. *Tamaşa salonu ağzına kimi dopdoludur.* C.Cabbarlı.

**DOPU** *is. məh.* Ağzı və dibi dar, qarnı isə gen, kiçik küpə şəklində saxsı qab. *Dopuda yağ, qatıq, süzmə, bəkməz saxlanır. – ..Hardasa yaxındakı yastı bir dam üstündə dopu çalıb rəqs eləyən kiçik qızların gülüşləri, aşağıda sağ tərəfdəki "Təzəpir" məscidinin minarəsindən ucalan axşam azanının səsi* [*gəlirdi*].. Ə.Məmmədxanlı.

**DOR, DORAĞACI** *is.* Müxtəlif məqsədlər üçün gəmilərin ortasında dikəldilən uzun dirək. *..Çıxasan dorağacına, baxasan dəryayə; Açasan bad əsən canibə yelkan, Yusif!* S.Ə.Şirvani. *Ki, nagah bir qara bayraq açıldı dorağacında; Yazılmış onda bir xətti-müsibətzayi-hürriyyət.* M.Ə.Sabir. *Deyəsən, batmış bir gəmini çətinliklə dənizdən çıxarırdılar, dorağacı yavaş-yavaş görünməyə başlayırdı.* Mir Cəlal.

◊ **Dor dibindən qaçan** *vulq.* – hər cür pis işdən çıxmış adam haqqında.

**DOSDOĞRU** *köhn.* b a x **dopdoğru** 2-ci mənada. *Zahirdən batinə dosdoğru yoldur.* Xətayi. [Pələng] *qalxdığı yerdən iki dəfə üstümə atıldı, üçüncü atılışda dosdoğru üstümə düşəcəkdi.* A.Şaiq.

**DOSÉNT** *is.* [*lat.*] Ali məktəb müəlliminin professordan aşağı, assissentdən yuxarı elmi dərəcəsi və adı, həmçinin həmin adı almış ali məktəb müəllimi. *Aynadan beş-altı yaş böyük olan qardaşı tibb institutunda dosent idi..* İ.Əfəndiyev.

**DOSENTLİK** *is.* Dosent vəzifəsi, dosent elmi adı. *Dosentliyə təqdim etmək. Dosentlik elmi adı almaq. Dosentlik etmək.*

**DOSENTÚRA** [*lat.*] 1. Dosent vəzifəsi, dosent adı.

2. *top.* Dosentlər.

**DOST** *is.* [*fars.*] 1. Birisi ilə dostluq münasibəti olan adam, yaxın yoldaş, arxadaş. *Köhnə dost. Uşaqlıq dostu. – Hər şeyin təzəsi, dostun köhnəsi.* (Ata. sözü). // Birinin yaxşılığını, xoşbəxtliyini istəyən, onu ürəkdən sevən (*düşmən* ziddi). [Yusif:] *Heç bundan yaxşı şey olarmı ki, qəlbdən istədiyin dostdan məktub alasan!* N.Nərimanov. *Neçə yüz ildən sonra biz də o məqama çata bilərik ki, gözümüzü açıb dostumuzu və düşmənimizi tanıyaq?* C.Məmmədquluzadə. ☐ **Dost olmaq** – aralarında dostluq münasibəti olmaq, ya yaratmaq, dostlaşmaq, arxadaş olmaq, yaxınlaşmaq. *Mirzağa, gəncliyinə baxmayaraq, bu vaxtadək bir qız və ya qadınla dost və arxadaş olmamışdı.* S.Hüseyn. [Dürrə:] *Mən tanış olmağı və dost olmağı, qəriblərlə oturub-durmağı sevən bir qadınam.*

M.S.Ordubadi. [Nuriyyə:] *Son kursda oxuyan Ayna adlı bakılı bir qızla dost olmuşduq.* İ.Əfəndiyev. **Dost tutmaq** – özünə dost saymaq, sevmək, çox xoşlamaq. *..Şairlər bahar fəslini hamıdan artıq dost tuturlar.* C.Məmmədquluzadə. [Təliə:] *Vəliəhd, mənə inan, mən şeri də sevirəm, hətta şeri layiqi ilə oxuyanları da dost tuturam.* M.S.Ordubadi.

2. *sif. mənasında.* Dostluğa əsaslanan, bir-birinə qarşı xeyirxah olan. *Dost ölkələr. Dost xalqlar.* // Tərəfdar, müdafiəçi, havadar. – *Sən həyat dostusan, ellər zinəti! İnsanlıq eşqidir köksündə yanan.* S.Vurğun. // *sif.* Sevən, istəyən, əziz tutan.

3. Adətən dosta, yaxın adama müraciət – dost! *Əziz dost!* – *Gəlin, dostlar! Qələmdaşlar! Fərhad kimi külüng vuraq; Biz yaradaq dünyamızın qəhrəmanlıq dastanını!* S.Vurğun. [Əhməd:] – *Xoş gördük, köhnə dost, sənsən, gecə vaxtı haradan gəlirsən?* İ.Şıxlı. *Bir azdan sonra Lütfəli özü üçün bir rumka da araq töküb: – Sağ ol, dostum! – deyə içdi.* İ.Musabəyov.

**DOSTANƏ** *zərf* [*fars.*] Dost kimi, mehribancasına, dostcasına. *Dostanə yaşamaq. Dostanə əlaqə saxlamaq.* – *Əlaqəmiz dostanədir. Bunu daha da möhkəm etmək lazımdır.* M.S.Ordubadi. *Cəlil ağa da dostanə, çox az qiymətə var-yoxunu Lütfəli bəyə icarəyə verib .. Avropaya səyahətə getdi.* İ.Musabəyov.

**DOST-AŞNA** *top.* Dostlar, yaxın adamlar, yaxın yoldaşlar. [Rüstəm bəy:] *Bir neçə nəfər dost-aşna çağırmışam, indi bu saat gələrlər, oturub söhbət edərik.* Ü.Hacıbəyov. *Gəmi yükün yan çəkər; Zəli sorar, qan çəkər; Yaxşı gündə dost-aşna; Yaman gündə can çəkər.* (Bayatı). [Ceyran xala:] *..Yəqin yoldaşları yaxşı deyil. Dost-aşna adamı düzəldər də, korlayar da.* S.Rəhman.

**DOST-AŞNALIQ** *is.* Dostluq, yaxınlıq, dostluq münasibəti.

**DOSTBAZ** *is.* [*fars.*] Ümumi işin zərərinə olaraq, xidmətdə və s.-də öz dostlarına üstünlük verən, onları himayə edən adam.

**DOSTBAZLIQ** *is.* Ümumi işin zərərinə olaraq xidmətdə və s.-də öz dostlarına və yaxın adamlarına üstünlük vermə, onları himayə etmə. *Dostbazlıq etmək.* – *Təəssüf ki, bəzən tənqiddən xoşa gəlməyən .. tərəfgirlik, dostbazlıq baş verir ki, baxanda quruyub qalırsan.* S.Rəhimov. [Orxan:] *Dostbazlığın, qohumbazlığın, yerlibazlığın kökü kəsilərdi. Kim nəyə layiqdirsə, o haqqı da alardı.* İ.Məlikzadə.

**DOSTCA(SINA)** *zərf* və *sif.* Dost kimi, mehribancasına, dost yaraşan bir tərzdə. *Dostcasına hərəkət etmək. Dostcasına yaşamaq. Dostcasına ayrılmaq. Dostcasına rəftar.*

**DOST-DOĞMA** b a x **doğma** 2-ci mənada. *İndi adlı-sanlı bir həkim onların dəmir sobasının yanında oturub. Özü də Xəlilin dost-doğma əmisi oğlu!* İ.Məlikzadə.

**DOST-DÜŞMƏN** *top.* [*fars.*] Həm xeyirxah olanlar, həm də olmayanlar; həm dost olanlar, həm də dost olmayanlar. [Turxan bəy oğlu Cəmilə acıqlı:] *Daha nə olacaq!.. Daha nə olsun ki, dost-düşmən içində bizi yerlərə soxdun.* H.Cavid. *Yalnız teatr sevgisi onları dost-düşmən yanında xar eləyir, ata-ana yanında başıaşağı edirdi.* S.Rəhman.

**DOSTLAŞDIRILMA** "Dostlaşdırılmaq"-dan *f.is.*

**DOSTLAŞDIRILMAQ** *məch.* Bir-biri ilə dost edilmək, bir-biri ilə yaxınlaşdırılmaq, aralarında dostluq əlaqəsi yaradılmaq.

**DOSTLAŞDIRMA** "Dostlaşdırmaq"dan *f.is.*

**DOSTLAŞDIRMAQ** *f.* Bir-biri ilə dost etmək, aralarında dostluq əlaqəsi yaratmaq, bir-biri ilə yaxınlaşdırmaq.

**DOSTLAŞMA** "Dostlaşmaq"dan *f.is.*

**DOSTLAŞMAQ** *f.* Bir-biri ilə dost olmaq, aralarında dostluq münasibəti yaratmaq. *Nəbi qaraçılarla yaxından dostlaşır.* "Qaçaq Nəbi". *Fərman da Qədir kişi ilə dostlaşmışdı.* Ə.Sadıq.

**DOSTLUQ** *is.* Qarşılıqlı etimad, ruhən yaxınlıq, mənafe birliyi və s. əsasında əmələ gələn yaxın münasibət. *Örtülü bazar dostluğu pozar.* (Ata. sözü). [Süleyman:] *Adam gərəkdir dostluqda düz ola.* Ü.Hacıbəyov. *Dostluq var ki, tufanlar, fırtınalar onu yıxa bilmir.* R.Rza. ☐ **Dostluq qatmaq** – dost olmaq, dostluq etmək, dost olmağa çalışmaq.

**DOSTPƏRƏST** *sif.* [*fars.*] 1. Dostunu sevən, dostluğu qiymətləndirən, dostluqda

sadiq olan. *Azərbaycanlıların dostpərəst olduqlarını bugünkü hadisələrlə təyin edə biləcəksən.* M.S.Ordubadi.

2. B a x **dostbaz**.

**DOSTPƏRƏSTLİK** *is.* 1. Dostu sevmə, qiymətləndirmə; dostluqda sədaqət.

2. B a x **dostbazlıq**.

**DOSTU** *is.* Hörmət üçün əmi və dayı arvadına verilən ad.

**DOSTUCAN** *is.* 1. B a x **dostu**.

2. İri, sarı və uzunsov qovun, yemiş. *Tağların üstündə sarı dostucan; Ağ, qara, çil qarpız qıpqırmızı qan.* H.K.Sanılı.

**DOSTYANA** b a x **dostca(sına)**.

**DOSTYANALIQ** *is.* Dost olma, dostluq göstərmə, dostluq münasibəti.

**DOSYÉ** *is.* [*fr.*] Müəyyən şəxs barədə sənədlər və materiallar toplusu, kadrlar üzrə şəxsi vərəqə.

**DOŞAB** *is.* [*fars.*] Üzüm, tut, əncir və qeyri meyvələrin şirəsinin qaynadılmasından hasil olan qəliz şirin maddə; bəkməz. *Tut doşabı. – ..Kənd əhli bilirlər ki, doşabsız xəşil olmaz.* Şəhriyar.

◊ **Doşab almışam (almışıq) bal çıxıb** – gözlənilmədən yaxşı çıxmış şey, adam haqqında. [Hacı Kamyab:] *Arvad, doşab almışıq, bal çıxıb. Qız Mirzə Əhməd ağanın evindədir. Ağa da qızın kəbinini özünə kəsmək istəyir.* Ə.Haqverdiyev.

**DOŞABLIQ** *is.* Doşab üçün yararlı. *Doşablıq üzüm.*

**DOTÁSİYA** [*lat.*] *mal.* Artıq xərcləri, zərəri və ya başqa ehtiyacları ödəmək üçün idarələrə, müəssisələrə və ya təşkilatlara dövlət tərəfindən verilən əlavə pul yardımı. *Dövlət dotasiyası.*

**DOTƏLƏB** *sif.* 1. Tələb edən, istəyən, almağa, əldə etməyə şiddətli həvəsi, arzusu olan. *Surxay! Sən bilirsən ki, bütün dünya ona dotələb idi.* C.Cabbarlı.

2. Özünü cəsarətlə irəli atan, qorxmayan; özünü davaya, toqquşmağa, mübahisəyə hazır kimi göstərən və buna hazır olan.

**DOTƏLƏBANƏ** b a x **dotələbcəsinə**.

**DOTƏLƏBCƏSİNƏ** *zərf* Dotələbliklə, cəsarətlə; davaya, toqquşmaya, mübahisəyə hazır kimi.

**DOTƏLƏBLİK** *is.* Dotələb olma; cəsarətlilik, qorxmazlıq. *Şerin ritmində Koroğluya xas olan bir dotələblik vardır.* M.Hüseyn.

**DOV** *is. dan.* Dava, hərbə-zorba. *Dinibdanışdığı davadır, dovdur; Söndürən ruzgardır, yandıran dovdur.* "Koroğlu".

◊ **Dov çəkmək** – səslənərək hücum etmək. *Məhəllənin adamları dov çəkib gəldilər.* **Dov düşmək** *dan.* – fürsətdən istifadə etmək, əlinə fürsət keçmək. **Dov gəlmək** – bərabər olmaq, öhdəsindən gəlmək, üstün gəlmək, qarşısında dura bilmək, ayaqlaşa bilmək, güc gəlmək. *İki it bir aslana dov gələr.* (Ata. sözü). *Zəhra xanım əllərini bir-birinə vurub qaqqıldadı: – Ay Kərim, çox öyünmə, Ayrım qızı dörd-beş kişiyə dov gəldi, – dedi.* A.Şaiq.

**DOVDAQ** *is.* 1. *zool. Durnalar* fəsiləsindən yeyilən iri çöl quşu.

2. *məc.* Çox asan aldadıla bilən, uzağı görməyən, dardüşüncəli adam haqqında. *Dovdaq adamı aldatmaq asandır. – Karvanbaşı cilovu əlinə almışdı və dovdaq kimi donub atın yanında dayanmışdı.* Ə.Məmmədxanlı.

**DOVĞA** *is.* Ayran, göyərti və düyüdən bişirilən duru xörək. *Ətli dovğa. Noxudlu dovğa. – Dovğa doqqazacan, qatıqlı aş qapıyacan.* (Ata. sözü). [Seyid dedi:] *Müsəlman aşpazı saxlayıram, gözəl plov, dovğa, dolma, küftə bişirir ki, ölü yesə, dirilər.* Ə.Haqverdiyev. [Nuriyyə:] *Mən yeməklərin hamısından çox dovğanı xoşlayıram.* İ.Əfəndiyev.

**DOVĞALIQ** *is.* Dovğa bişirmək üçün yarar, dovğa üçün ayrılmış. *Dovğalıq qatıq.*

**DOVLA** *is. ovç.* Kəklik və turacı aldadıb ovlamaq üçün ovçuların istifadə etdikləri şux rəngli parçadan bürüncək; tələ. *Namərd ovçu dovla qurar arxadan; Göyqurşağı, çöl düzünə, aldanma.* R.Rza.

**DOVLALI** *sif. ovç.* Dovlası olan, dovlaya bürünmüş (ovçu).

**DOVŞAN** *is.* 1. Gəmiricilər dəstəsindən qabaq ayaqları dal ayaqlarından qısa, uzun və dik qulaqlı, dodağı yarıq kiçik heyvan. *Dovşanlar otla və bitki ilə keçinir. Dovşan əti dadsız olur. – Dovşanın gümanı ayaqlarına gələr.* (Ata. sözü).

2. *məc.* Qorxaq, cəsarətsiz adam haqqında.

◊ **Dovşan bığı** – xeyrə-şərə yaramayan adam haqqında. **Dovşan qulağı** – dik duran şey haqqında. *Toybəyi bığlarını dovşan qulağına döndərmişdi.* Mir Cəlal. **Dovşan ürəkli** – ürəksiz, cürətsiz, qorxaq. **Dovşan yuxusu** – qısa, lakin bərk yuxu, dərin yuxu. **Dovşana qaç, tazıya tut demək** – ikiüzlülük etmək. **Dovşanı araba ilə tutmaq** – bir şeyi üsulluca, tələsmədən, səbirlə, ustalıqla əldə etməyə çalışmaq.

**DOVŞANALMASI** *is. məh.* Dağlarda öz-özünə yetişən bir ağac və onun alma kimi xırda və acı meyvəsi. *Bir sıra dovşanalması növləri bəzək bitkisi kimi parklarda və bağlarda becərilir.* H.Qədirov.

**DOVŞANCIĞAZ** "Dovşan" *söz. oxş.*

**DOVŞANCIQ** *is.* Balaca dovşan, dovşan balası.

**DOVŞANCIL** *is.* Çalağan, quzğun.

**DOVŞANÇI** *is.* Dovşançılıqla məşğul olan adam.

**DOVŞANÇILIQ** *is.* Dovşan, xüsusilə adadovşanı yetişdirmə işi.

**DOVŞANDODAQ**[1] *sif. dan.* Dodağının ortası yarıq. *Dovşandodaq uşaq.*

**DOVŞANDODAQ**[2] *is. bot.* Dodaqçiçəklilər fəsiləsindən çoxillik bitki.

**DOVŞANTƏPƏL** *sif. dan.* Dar qaşqalı təpəl at.

**DOVŞANYATIŞI** b a x **dovşan yuxusu** (**"dovşan"**da).

**DOVTƏLƏB** b a x **dotələb**.

**DOVUXMAQ** b a x **donuxmaq**.

**DOYDURMA** "Doydurmaq"dan *f.is.*

**DOYDURMAQ** *f.* 1. Tox hala gətirmək, doyunca yedirmək, yemək vermək. *Aclıq mənə lap kar etmişdi, durdum ki, evimizə gedib bu arsızı doydurdum.* A.Divanbəyoğlu.

2. *kim.* Bir mayeni, öz içərisində çoxlu miqdarda başqa maddəni əridəcək (həll edəcək) dərəcəyə çatdırmaq.

◊ **Cana doydurmaq** – b a x **can**.

**DOYDURUCU** *sif.* Kifayət qədər qidalı; doyduran, doyumlu. *Doydurucu yemək.*

**DOYDURULMA** "Doydurulmaq"dan *f.is.*

**DOYDURULMAQ** *məch.* Tox hala gətirmək, doyunca yedirilmək.

**DOYMA(MA)ZLIQ** *is.* Doymayan, həddindən artıq çox yeyən adamın hal və keyfiyyəti; acgözlük, qarınquluqluq.

**DOYMA** "Doymaq"dan *f.is.*

**DOYMAQ** *f.* 1. Yeməyə olan ehtiyacı rəf olmaq, lazımınca yeyib tox hala gəlmək, qarnı tox olmaq. *Bu xörəkdən doydum. – Bozbaşdan doymaq istəyirsənsə, qonaqlarını tox hala salmaq istəyirsənsə, çölməyə çox ət sal.* C.Məmmədquluzadə. *Başını xörəklərin xonçasına əymişdi, əlini nimçənin üzərində saxlayıb, mənim doymağımı gözləyirdi.* M.S.Ordubadi.

2. *kim.* Öz içərisində çoxlu miqdarda başqa maddəni əritmək, həll etmək, canına çəkmək.

3. *məc.* Bezikmək, bıqmaq, təngə gəlmək, ürəyini vurmaq; soyumaq. *Yar məndən doyubdursa; Mən yardan doymamışam.* Sarı Aşıq. *Gəncədə bir kişi övrətindən doyanda belə bəhanə eləyir ki, məsələn, "məlunə övrət mənim anamı söyür və məndən izin almamış həyətə çıxır".* C.Məmmədquluzadə.

◊ **Cana doymaq** – b a x **can**. [Mələk] *cana doysa da, hələ qəti qərara gələ bilmirdi.* İ.Şıxlı.

**DOYMAMIŞ** *f.sif.* 1. Doyunca yeməmiş, yeməyə olan ehtiyacı tam surətdə olmamış; alaqarın.

2. *kim.* Öz içərisində kifayət maddəni əritməmiş, həll etməmiş, çəkməmiş; tərkibində tələb olunan maddələr olmayan.

**DOYMAZ** *sif.* Doymaq bilməyən, həddən artıq çox yeyən; acgöz. *Doymaz adam.*

**DOYMUŞ** *f.sif.* 1. Yeməyə olan ehtiyacı rəf olmuş, yeyib tox hala gəlmiş.

2. *kim.* Öz içərisində çoxlu miqdarda maddələr əritmiş, həll etmiş, canına çəkmiş. *Doymuş məhlul.*

**DOYUM** *is.* Doyma, doydurma. *Bir doyum saman. Bir doyum yer.*

**DOYUMLU** *sif.* Doyduran, doydurucu, qidalı. *Qəbul olunan qida dadlı, mənfəətli, doyumlu olmalıdır.*

**DOYUMLUQ** *is.* Doymağa kifayət edən qədər. *Bir doyumluq un. – Qarpız doyumluq üçün deyil, sərinlik üçündür.* (Ata. sözü.). [Vaqif:] *Hər şey doyumluq olsa, zövq olarmı, həsrət olarmı?* Çəmənzəminli.

**DOYUNCA** *zərf* 1. Doyana qədər. *Doyunca yemək. – Tut ağacı boyunca; Tut yemədim doyunca.* (Bayatı). [Əsgər:] *Barı bir zəhmətə görə, əziyyətə görə doyunca adama çörək verə, yenə dərd yarıdır.* N.Vəzirov. *..Hamımız süfrə başına oturub qatıq, yağ, qaymaqdan doyunca yedik.* A.Şaiq.

2. *məc.* İstədiyi qədər, çoxlu, ürəyinin ehtiyacı rəf olunca. *Doyunca gəzmək. Doyunca danışmaq. – Qoy doyunca baxsın, etsin tamaşa; Heyrandı göz-gözə, qurban olduğum!* M.P.Vaqif. *Ol qəmli gecə sabah olunca; Rahat yuxu yatdı bir doyunca.* A.Səhhət. *..İlk dəfə gördüyüm bu yerlərin gözəlliklərini doyunca seyr etmək üçün tüfəngi çiynimdən çıxarmadan arxadan gedirdim.* M.Rzaquluzadə.

**DOYURMA** "Doyurmaq"dan *f.is.*

**DOYURMAQ** *f.* 1. Yedirmək, qarnını doydurmaq, aclığını rəf etmək. *Arvad məni inandırır ki, bir çox ac itlər və heyvanlar öz rizqlərini zibildə tapırlar; onları doyurmaq da savabdır.* C.Məmmədquluzadə. *Bol nemətli, bərəkətli hövzəsi Nilin; Doydurmadı qarnını yoxsul misirlinin.* O.Sarıvəlli. *Dənizdəki balıq ac adamı nə qədər doyurarsa, məhbuslara da bu ümid o qədər təsəlli verirdi.* Mir Cəlal.

2. *məc.* Yalandan vədlər verərək xatircəm etmək. *..Mirzağa Bülluri Helmini və İbrahim Fövzini vədlərlə doyururdu.* M.S.Ordubadi.

3. B a x **doydurmaq** 2-ci mənada. *Məhlulu doyurmaq.*

**DOYUZDURMA** "Doyuzdurmaq"dan *f.is.*

**DOYUZDURMAQ** b a x **doydurmaq**. *Yatdıq və səhər dedilər ki, gecə oğru inək hara isə əkilib və qarnını doyuzdurub, sübh tezdən qayıdıb gəlibdir.* C.Məmmədquluzadə.

**DOYUZDURULMA** "Doyuzdurulmaq"-dan *f.is.*

**DOYUZDURULMAQ** b a x **doydurulmaq**.

**DÓZA** [*yun.*] Bir dəfədə, yaxud bir gün ərzində qəbul etmək üçün müəyyən edilən dərman və s.-nin miqdarı. *Dozanı azaltmaq* (*əskiltmək*).

**DOZALAMA** "Dozalamaq"dan *f.is.*

**DOZALAMAQ** *f.* Dozalara bölmək, dozasını müəyyən etmək.

**DOZALANMA** "Dozalanmaq"dan *f.is.*

**DOZALANMAQ** *məch.* Dozalara bölünmək, dozası müəyyən edilmək.

**DOZANQURDU** *is.* 1. Özünümüdafiə üçün bədənindən pis qoxu ifraz edən bir böcək; qaraböcək. *Rusiyanı görməyənlərə bunu ərz etməliyəm ki, Rusiya nömrələrində həşəratülərzdən hər nə istəsən tapılar: birə, taxtabiti, siçan, tarakan deyilən bir növ dozanqurdu ki, adına bizim kəndlərdə "qara fatma" deyirlər.* Haqverdiyev.

2. *məc. dan.* Çox çirkin, qara, arıq adam haqqında. *Lap dozanqurduna oxşayır.*

**DÖHÜL** *is. köhn.* Nağara, təbil, davul. *Qoca hələ sözünü tamamlamamışdı ki, birdən .. döhül vuruldu.* "Koroğlu". *Çalındı döhül, köçdü bütün qafilələr.* Ə.Nəzmi.

**DÖL** *is.* 1. Rüşeym, maya. *Döl üçün ayrılan xınaquyruqlu qoçlar .. döyükmüş ətrafa baxırdılar.* S.Rəhimov. // Ana bətnində bala. // Mayalanma, döllənmə dövrü. ☐ **Döl düşmək** – ev heyvanlarının doğum vaxtı çatmaq. **Döl salmaq** – 1) doğub törəmək, törəyib artmaq. *Dağın bir tərəfində kəkliklər döl salmışdır;* 2) bitib artmaq, çoxalmaq, yayılmaq. *Bu dağda cır alma yaman döl salmışdır.*

2. Cins. *Ərəb atı dölü. Qarabağ qoyunu dölü.* – [Müsyö Jordan:] *Hatəmxan ağa, .. bir ay bundan əvvəl Qarabağın əlyetməz dölündən köhlən at altında gəlib sizə qonaq olan xoşbəxt adam .. əgər Qarabağa gəlməyəydi, bu qədər dövləti haradan ələ salardı?* M.F.Axundzadə. // Döllük heyvan. *Şən balalar, dağ gövdəli erkəklər; Bax, bu əsil, tosqun döllər bizimdir.* A.Şaiq.

3. *məc.* Nəsil mənasında. [Güllü:] *Abbasın dölünə nə deyəsən?* S.Rəhimov.

**DÖLÇÜ** *is. k.t.* Döl mütəxəssisi olan zootexnik.

**DÖLÇÜLÜK** *is.* Döllük, cinslik heyvan yetişdirmə işi.

**DÖLLƏNDİRİLMƏ** "Döllendirilmək"-dən *f.is.*

**DÖLLƏNDİRİLMƏK** *məch. biol.* Rüşeym əmələ gətirilmək; mayalandırılmaq.

**DÖLLƏNDİRMƏ** "Dölləndirmək"dən *f.is.*

**DÖLLƏNDİRMƏK** *f. biol.* Erkək və dişi hüceyrələrini birləşdirməklə rüşeym əmələ gətirmək; mayalandırmaq.

**DÖLLƏNMƏ** "Döllənmək"dən *f.is.*

**DÖLLƏNMƏK** *f.* Döl salmaq, döl bağlamaq; mayalanmaq.

**DÖLLÜK** *sif.* Dölə yarayan, döl üçün ayrılan; cins, cinslik.

**DÖLMƏ** *is. dan.* Dalan, aralıq. *Qır iyi dölmədən gəlirdi.* Mir Cəlal.

**DÖLSÜZ** *sif. biol.* Döl verməyən, dölü olmayan; balası olmayan, nəsil verməyən, sonsuz; mayalanmayan.

**DÖLSÜZLƏNDİRİLMƏ** "Dölsüzləndirilmək"dən *f.is.*

**DÖLSÜZLƏNDİRİLMƏK** *məch. biol.* Dölsüz hala salınmaq.

**DÖLSÜZLƏNDİRMƏ** "Dölsüzləndirmək"dən *f.is.*

**DÖLSÜZLƏNDİRMƏK** *f. biol.* Ürəmək və ya ürətmək qabiliyyətindən məhrum etmək. *Erkək atı axtalamaqla dölsüzləndirmək olar.*

**DÖLSÜZLƏNMƏ** "Dölsüzlənmək"dən *f.is.*

**DÖLSÜZLƏNMƏK** bax **dölsüzləşmək**.

**DÖLSÜZLƏŞDİRİLMƏ** "Dölsüzləşdirilmək"dən *f.is.*

**DÖLSÜZLƏŞDİRİLMƏK** bax **dölsüzləndirilmək**.

**DÖLSÜZLƏŞDİRMƏ** "Dölsüzləşdirmək"dən *f.is.*

**DÖLSÜZLƏŞDİRMƏK** bax **dölsüzləndirmək.**

**DÖLSÜZLƏŞMƏ** "Dölsüzləşmək"dən *f.is.*

**DÖLSÜZLƏŞMƏK** *f. biol.* Ürəmək və ya ürətmək qabiliyyətini itirmək.

**DÖLSÜZLÜK** *is. biol.* Ürəmə və ya ürətmə qabiliyyətinin olmaması; sonsuzluq.

**DÖLVERİCİLİK** *is. biol.* Dölvermə qabiliyyəti.

**DÖNDƏRİLMƏ** "Döndərilmək"dən *f.is.*

**DÖNDƏRİLMƏK** "Döndərmək"dən *məch.* *Sağa döndərilmək. Üzüaşağı döndərilmək. Fikrindən döndərilmək.*

**DÖNDƏRİŞ** bax **döndərmə¹** 2 və 3-cü mənalarda.

**DÖNDƏRMƏ¹** *is.* 1. "Döndərmək"dən *f.is.*

2. *mus.* Əsas havanın ardınca çalınan yüngül hava. *Aşıqlar ağır havadan keçirlər döndərməyə.* Ə.Haqverdiyev.

3. *dan.* Döngə, dönüş.

**DÖNDƏRMƏ²** *is.* 1. *məh. k.t.* Taxılın ikinci dəfə suvarılması.

2. *köhn.* Süd, qatıq və s. qablarının üstünü örtmək üçün qamışdan, ağacdan və s.-dən qayrılma qapaq, örtü.

**DÖNDƏRMƏK** *f.* 1. İstiqamətini yana və ya geriyə, yaxud başqa tərəfə yönəltmək. [Rüstəm] *yavaşca öküzün boynuna vurub həyətə döndərdi.* S.Rəhimov. *..Şirəhməd gördü ki, maşını döndərməyə yer qalmamışdır.* H.Seyidbəyli.

2. Əvvəlki vəziyyətinin əksinə dəyişmək. // Bir tərəfə çevirmək. *Üzünü bizə tərəf döndərdi. – Döndərmək çox çətindir, Onu öz axarından. Axar su kir götürmür.* B.Vahabzadə.

// Tuşlamaq, yönəltmək. *Topun ağzını, hədəfə döndərmək.*

3. Tərsinə qoymaq, çevirmək. *Stəkanı ağzı aşağı döndərmək. Üzü üstə döndərmək.* // Böyrü üstə yıxmaq, devirmək, aşırmaq. *Arabanı döndərdi. Qazanı döndərmək.* // İçini bayırına və ya önünü arxasına çevirmək. *Yastığı döndərmək.*

4. ...şəklinə salmaq, ...halına salmaq, ...çevirmək. *Suyu buza döndərmək. – Gör necə alt-üst eləyib şeyləri; Döndərib "a-ba"ya "əlif-bey"ləri.* M.Ə.Sabir. *Əhməd varyoxunu satıb nağd pula döndərdi ki, özü ilə aparsın və oradan mal alıb buraya gətirsin.* B.Talıblı. *Xandostu! Düşübdür yeni sövdayə bizim qız! Düz qəddimi döndərdi mənim yayə bizim qız!* Ə.Nəzmi.

5. Soldurmaq. *Günəş paltarın rəngini döndərdi. – Zəfəran tək bənzimi döndərdi ol birəhm yar.* Nəsimi.

6. İnandıraraq qəbul etdirmək. [Axund Səməd:] *Hətta mən istədim ki, cuhudlara .. dəxi əl qatıb onları da şiə məzhəbinə döndərim, amma bir para kimsənələr məsləhət görmədilər ki, lüzumu yoxdur.* M.F.Axundzadə.

7. Vaz keçdirmək, əl çəkməyə məcbur etmək; daşındırmaq. *Fikrindən döndərmək. Qəsdindən döndərmək. – Dinini döndərgil, ey zahid, ki yaxşı din degil.* Füzuli. *Heç bir təhlükə, heç bir qorxu* [Firidunu] *qərarından döndərə bilmədi.* M.İbrahimov.

◊ **Üz döndərmək** – bax **üz**. *Sayadım sayıq deyil; Yatıbdı, ayıq deyil; Söz verib üz döndərmək; Heç yara layıq deyil.* (Bayatı).

**DÖNƏ** *is. məh.* Dəfə, yol. *Bu dönə.*

**DÖNƏCƏK** *is.* Tin, döngə. *..Tarqovı küçəsinin dönəcəyində rastımıza bir neçə avtomobil çıxdı.* C.Məmmədquluzadə.

**DÖNƏ-DÖNƏ** *zərf* Dəfələrlə, bir neçə dəfə; təkrar-təkrar. *"Cəfa çəkmə, məndən sənə yar olmaz"; Dönə-dönə dedi o dilbər mənə.* Q.Zakir. *Çıxacaqlar göyləri aşaraq dönə-dönə; Buludların fövqünə.* M.Müşfiq. *Dilara .. məktubları dönə-dönə oxuyurdu.* Ə.Məmmədxanlı.

**DÖNƏK** bax **dönük**. *Qəhr olsun o qəhrəman ki dönəkdir; Dünya gözəl olsa, dönməm yarımdan.* H.Cavid.

**DÖNGƏ** *is.* Küçənin, yolun, arxın və s.-nin dönən, burulan yeri. [Avtomobil] *..gah dolayın döngələrində gizlənib yox olur, gah döngədən çıxıb yavıqlaşır.* C.Məmmədquluzadə. *..Ağıryüklü fayton əyri-üyrü və eniş-yoxuş yollara çatdıqda bir döngədə aşıb oxu və çarxı sındı.* S.S.Axundov. // Əsas küçədən ayrılan kiçik, dar küçə. *Əyri döngələrdə, dar küçələrdə; Səs-səmir kəsilir, adam azalır.* R.Rza. *..Döngələrin birində* [Səriyyə xala və uşaqları] *qaynar bir izdihamın içinə düşdülər.* M.İbrahimov. // Küçənin tini. *Qarı isə məscid yanında durub, oğlu döngə başında gözdən itincəyə qədər onun ardınca baxdı.* Ə.Məmmədxanlı.

**DÖNGƏL** *is. məh.* Cır əzgil.

**DÖNGƏLƏMƏ** "Döngələmək"dən *f.is.*

**DÖNGƏLƏMƏK** *f. dan.* Vədini, qərarını dəyişmək; sözündən dönmək (qaçmaq). *Sözünü döngələmək.*

**DÖNGƏLİ** *sif.* Döngəsi, ya döngələri olan. *Döngəli yol, küçə. – Rüstəm fikirləşə-fikirləşə .. döngəli yolları qalxıb evinə çatdı.* S.Rəhimov. *Qədir dar küçəli, qaranlıq döngəli bazarlarda sərsəri kimi mənasız dolaşırdı.* Mir Cəlal.

**DÖNMƏ** 1. "Dönmək"dən *f.is.*

2. *sif.* Cinsini, nəslini dəyişmiş; dönmüş. // Dinini, məzhəbini, əqidəsini dəyişmiş. *– Farsdan dönməsiniz, – dedilər bizə. Baxıb gözümüzün içinə dimdik, Onlar qəsd elədi mənliyimizə.* B.Vahabzadə.

**DÖNMƏDƏN** *zərf* Qəti və ardıcıl surətdə. *Göstərişləri dönmədən yerinə yetirmək.*

**DÖNMƏK** *f.* 1. Getdiyi, ya durduğu tərəfin əksinə çevrilmək. *Sağa dön! – Atlı .. bütün vücudu ilə səs gələn səmtə döndü.* M.Hüseyn. // İstiqamətini dəyişmək, başqa tərəfə yönəlmək. *Küçəni dönərkən bir Çin polisi onun qabağını aldı.* S.S.Axundov. // "Dönüb", "dönərək" şəklində – 1) Başını, üzünü çevirərək. *Yeriyəndə dönüb dalı baxmağı; Ahunun balası səndən öyrənib.* Q.Zakir. *Şirzad dönüb Qoşatxanı gördükdə tələsik ona tərəf getdi, əl verdi, salamlaşdı.* M.İbrahimov. *Tofiq dönüb marığa sarı baxdı ki, quşun necə olduğunu Elçindən öyrənsin.* M.Rzaquluzadə; 2) qayıdaraq, cavab olaraq, cavabında. *Dönüb belə dedi...*

2. Qayıtmaq, geri qayıtmaq. *Gedib axşam dönəcəyəm. Şəhərdən dönmək. Yoldan dönmək* (yarı yoldan qayıtmaq). *– Köç dönəndə axsaq keçi qabağa düşər.* (Ata. sözü.). *Bir gün Qərənfillə Bahadır yenə adi qayda üzrə bir yerdə evə dönürdülər.* S.Rəhman.

3. Sözünü, vədini, qərarını pozmaq, sözündən qaçmaq. *Sözündən dönmək. Əhdindən dönmək. Qərarından dönmək.* // İmtina etmək, əl çəkmək, üz döndərmək, vəfasızlıq etmək, dönüklük etmək. *Əqidəsindən dönmək. Məsləkindən dönmək. – Mirzə Valeh dediyindən dönmədi.* S.Rəhimov.

4. ...halına düşmək, ...şəklini almaq. *Axşam oldu, boz buludlar; Döndü vulkanlı dağlara..* H.Cavid. *Keçmişin taleyi sönmüş bu gecə; İşçilər aslana dönmüş bu gecə.* M.Müşfiq. // Çevrilmək. *Aşıq azadə gərəkdir ki, dönər zindanə; Bərgi-güldən ola gər bülbüli-şeydayə qəfəs.* S.Ə.Şirvani. *Dostun firqətindən, yar həsrətindən; Bahar mənə zimistanə dönübdü.* Aşıq Ələsgər. *Mən bu vətən torpağını tanıyıram, ona insan əli toxunan kimi o, təzədən bir cənnətə dönəcəkdir.* Ə.Məmmədxanlı. // Keyfiyyəti dəyişmək, başqa keyfiyyət almaq. *Şərab ağzıaçıq qalanda turşuyub sirkə olur və sirkə açıq qalanda dönüb su olur.* H.Zərdabi. *Əriyib suya dönərsən; Axıb çaya gedərsən.* M.Ə.Sabir. *Ağır tanklar külə döndü, sovrularaq havaya.* Ə.Cəmil. // Ümumiyyətlə, dəyişmək, başqalaşmaq, pisləşmək. [Məşədi Cəfər:] *..Ruzgar elə dönübdür ki, qardaş qardaşa etibar eləyib girovsuz bir qəpik borc verməyir.* Ə.Haqverdiyev.

5. Dövr etmək, fırlanmaq, hərlənmək. *Təkər öz oxu üzərində dönür.* – [Oynayanlar] *bir-birinin ardınca ikibir, üçbir əl-ələ tutaraq foyenin ortasındakı orkestrin ətrafına dönürdülər.* S.Hüseyn. *Qatarın çarxları durmadan dönür; İşıqlar görünmür, işıqlar sönür.* N.Rəfibəyli.

6. Yıxılmaq, çevrilmək, aşmaq. *Üzü üstə dönmək.*

7. Oxşamaq, bənzəmək. *Lap uşağa dönmüsən. İncəlib qıla dönmək* (çox arıqlamaq).

8. Ötmək, keçmək. *Sən görən əyyami-güzəştə hanı? Döndü zəmanə, fələkin dövranı.* Aşıq Pəri.

**DÖNMƏKSİZİN** b a x **dönmədən**.

**DÖNMƏZ** *sif.* Səbatlı, əzmli, dözümlü, qərarında möhkəm və ardıcıl. *Dönməz qəhrəman. Dönməz iradə. – Rüstəm kişini həmişə qüvvətli və dönməz görməyə alışmış Səkinə şikayətlənməsinə dözə bilmədi.* M.İbrahimov. *Sən dönməz balıqçısan; Yoldaşların səbatlı.* M.Rahim.

**DÖNMƏZLİK** *is.* Səbat, dözümlülük, əzmkarlıq, qərarında möhkəmlik və ardıcıllıq. *Qocaoğlu dönməzliklə* (z.) *hərəkət edir, həyat təcrübəsi də işdə ona az kömək etmirdi.* S.Rəhimov.

**DÖNÜK** *sif.* Sözündə, əhdində, məsləkində durmayan; səbatsız, etibarsız, vəfasız. *Dönük adam. – Aslan .. dönük fikirli və zəif iradəli adamları sevməzdi.* M.İbrahimov. ☐ **Dönük çıxmaq** – dönüklük göstərmək, vəfasız, etibarsız çıxmaq. *Dünənə qədər mənim xəyalımla yaşayan bir qız birdənbirə nə üçün dönük çıxa idi?* Mir Cəlal. *Şerə yamaq vuranlara insan sözü qoy ar olsun! Şair olan dönük çıxmaz, yolunda min ruzgar olsun.* R.Rza.

**DÖNÜKLÜK** *is.* 1. Əhdində, sözündə durmama; səbatsızlıq, etibarsızlıq, vəfasızlıq. *Dönüklük etmək.* – [Əmiraslan ağa:] *Yoxsa dönüklük olmuşdur?* S.S.Axundov. *Onda qubernator .. deməzdimi ki, ay Müqim bəy Cavanşir, bu nə dönüklük azarıdır ki, səni yaxalayıbdır.* S.Rəhimov.

2. Dəvətdən, çağırışdan imtina etmə; çağırılan yerə getməmə. *Belə bir halda nə qədər süfrə dolu olsa, yenə qonaq dönüklük edər, bu ev onu məngənə kimi sıxar.* S.Rəhimov.

**DÖNÜM** *is.* 1. Dönmə, dönüş, qayıtma, dolanma.

2. Dəfə, kərə. *Bir dönüm. Bu dönüm.*

**DÖNÜŞ** *is.* 1. Qayıdış, qayıtma, geri dönmə.

2. *məc.* Bir şeyin gedişində, inkişafında əsaslı və ciddi dəyişiklik. *İşdə dönüş yaratmaq.* – [Səttar xan:] *Qüvvət bacarıqdan, qorxmamaqdan və kütlədə dönüş yaratmaqdan ibarətdir.* M.S.Ordubadi.

3. B a x **dönüm** 2-ci mənada. [Ana:] *Qadan alım, oğlum, bu dönüş də mənim sözümü eşit.* (Nağıl). *Gündə yüz dönüş mənim dalımca gəlir, mən də o gələndə qaçıb gizlənirəm..* C.Cabbarlı.

**DÖRD** *miqd. s.* 1. Üçdən sonra gələn və 4 rəqəmi ilə işarə olunan say və miqdar. *İki dəfə iki – dörd. Dörd yaş.*

2. Beşballı sistemdə şagirdin, tələbənin müvəffəqiyyətini göstərən və "yaxşı" ifadə edən nömrə. *Dərslərdən 4 almaq.*

◊ **Dörd bir tərəf** – dövrə, hər tərəf, hər yan, ətraf. *Qalanı dörd bir tərəfdən mühasirəyə aldılar.* **Dörd bir yan** – b a x *dörd yan*. *Bu görünən qaladır; Dörd bir yanı taladır.* (Bayatı). **Dörd divar(ın) arasında** və ya **içində qalmaq (oturmaq)** – b a x **divar**. **Dörd əllə** – ürəklə, həvəslə, bərk-bərk. *Naz-naz Qaraşı vurub çölə atmadı, gün-gündən dörd əllə ondan yapışdı.* M.İbrahimov. **Dörd gözlə** – 1) səbirsizliklə, böyük bir intizarla. *Dörd gözlə gözləmək. – ..Hamısı da axır möhtərəm Elçinin yolunu dörd gözlə gözləyirdilər!..* S.Rəhimov; // diqqətlə, böyük həvəslə. *Anamın şəklini görüb dörd gözlə qəzeti oxumaq istədim.* Mir Cəlal; 2) çox sayıq bir surətdə. **Dörd olmaq** – çox böyümək, çox artmaq. *Yenə dörd oldu suyu irmağın.* Nəsimi. **Dörd tərəf** – b a x **dörd bir tərəf**. [Aydəmir:] *Yoldaşları dörd tərəfdən atdılar.* C.Cabbarlı. **Dörd yan** – b a x **dörd tərəf**. *Göy yamacın ətəyində kəndciyəz; Dörd yanında dalğalanır tarlalar.* A.Şaiq. *Hər gölməçənin dörd yanında torpaqdan sədd çəkmişdilər.* M.Hüseyn. **Dörd yanına (tərəfinə) baxınmaq (boylanmaq)** – çaşmaq, şaşırmaq, çaşaraq təlaşla ətrafına baxınmaq. **Dörddə alacağım (alacağın, alacağı) yox, beşdə verəcəyim (verəcəyin, verəcəyi)** – dərdsizlik, qayğısızlıq mənasında. **Dörd-**

**də bir** – çox az miqdar, bir şeyin çox az hissəsi. *Ey əcəb, mən ki sədaqət yolunu azmayıram! Hələ gördüklərimin dörddə birin yazmayıram!* M.Ə.Sabir.

**DÖRDADAMLIQ** *sif.* Dörd adam üçün olan. *Dördadamlıq loja, kupe.* // Dörd adamdan ibarət. *Dördadamlıq qrup.*

**DÖRDAŞIQ** *is. köhn.* Aşıqla oynanılan qumar oyunlarından biri. *Çünki onların bəzisi dükanlarda gün keçirdir, qeyrisi köhnə hamamlarda dördaşıq atır.* N.Vəzirov.

**DÖRDATLI** *sif.* İki cüt (dörd) at qoşulmuş. *Dördatlı faytonlar gözəl bəzəkli.* H.K.Sanılı. *Bazar günü idi. Onlar dördatlı faytonu qoşdurub Şuşa şəhərinə gedəcəkdilər.* Ə.Vəliyev.

**DÖRDAVARLI** *sif.* İki cüt avarı olan. *Dördavarlı qayıq.*

**DÖRDAYAQ[1]** 1. *zərf* Çaparaq, çox sürətli, çox cəld. *Dördayaq get, onu çağır.*

2. *is.* Atın dörd ayağını da yerdən üzüb atıla-atıla çapması (at yerişi).

**DÖRDAYAQ[2]** *is. məh.* 1. Üstündə xəmir yaymaq üçün ayaqlı taxta alət; yuxayayan, mərdənə. *Dördayağı gətir, yuxa yay.*

2. Ev heyvanı, iş heyvanı.

3. Kətil.

**DÖRDAYAQLI[1]** 1. *sif.* Dörd ayağı olan. *Dördayaqlı masa.*

2. *is.* Dörd ayağı üzərində gəzən; heyvan. *Hacı Səməd ağa rəiyyəti qapıda gəzən dördayaqlılardan seçmir.* Ə.Haqverdiyev.

3. B a x **dördayaq[1]** 1-ci mənada. *Mahmud əminin iki ayağı varsa, ikisini də sanki satın alıb, dördayaqlı yüyürərək kəndə getdi.* B.Talıblı.

**DÖRDAYAQLI[2]** *is.* Sacayaq növü.

**DÖRDAYLIQ** *sif.* 1. Dörd ay əvvəl doğulmuş. *Dördaylıq uşaq. Dördaylıq buzov.*

2. Dörd ayda görüləcək, dörd ay müddətində olan, dörd ay davam edən. *Dördaylıq plan. Dördaylıq təlim.*

**DÖRDBARMAQ(LI)** *sif.* Dörd barmağı olan. *At öz əcdadı olan dördbarmaqlı heyvandan təkamül edib üçbarmaqlı, sonra isə birbarmaqlı – təkdırnaqlı heyvan olmuşdur ki, indi də biz onu belə təkdırnaqlı heyvan kimi tanıyırıq.*

**DÖRDBAŞ(LI)** *sif.* Dörd başı, dörd təpəsi olan.

**DÖRD-BEŞ** *say.* Dörd, ya beş ədəddən və s.-dən ibarət olan. *Biz məktəbdə gündə dörd-beş dəfə əllərimizi sabunla yuyuruq.* Ə.Haqverdiyev. *Onun yanında orta yaşlı iki kişi və dörd-beş yaşlı bir oğlan uşağı vardı.* İ.Şıxlı.

**DÖRDBÖLGÜLÜ, DÖRDBÖLÜŞLÜ** *sif.* Dörd gözdən (bölmədən, hissədən) ibarət olan. *Dördbölüşlü duzqabı. Dördbölgülü meydan.*

**DÖRDBÖYRƏK** *sif. dan.* İgid, qorxmaz, ciyərli. *Yaman küyçü qocadır! – Yox, küyçü deyil, dördböyrək kişidir. Görmürsən, elə bil dağ gedir?* S.Rəhimov.

**DÖRDBUCAQ** *is. riyaz.* Dörd bucağı olan həndəsi cisim.

**DÖRDBUCAQLI** *sif.* Dörd bucağı olan; dördkünc. *Dördbucaqlı otaq. Karvansara dördbucaqlı bir tikintidir.*

**DÖRDCƏ** *say.* Ancaq dörd, cəmi dörd. *Dördcə adam gəlmişdir. Dördcə qəpik pul qalmışdır.*

**DÖRDCƏRGƏLİ** *sif.* Dörd cərgəsi olan, dörd sırası olan. *Dördcərgəli xiyaban. Dördcərgəli oturmaq yeri.*

**DÖRDCİLDLİK** *sif.* Dörd cilddən ibarət. *Dördcildlik lüğət.*

**DÖRDÇARXLI** b a x **dördtəkərli**.

**DÖRDDƏFƏLİ** *sif.* Dörd dəfə təkrar edən.

**DÖRDDƏQİQƏLİK** *sif.* Dörd dəqiqə davam edən, sürən. *Dörddəqiqəlik istirahət.*

**DÖRD-DÖRD** *zərf* Hər dəfədə dörd ədəd, yaxud hər dəstədə dörd nəfər olaraq. *Əsgərlər dörd-dörd gedirdilər. Dörd-dörd yığmaq.*

**DÖRDDÜYMƏ** *sif.* Ölçüsü, qalınlığı və s. dörd düymə olan (b a x **düymə[2]**). *Dörddüymə mıx* (*taxta*).

**DÖRDDÜYMƏLİ** *sif.* Dörd düyməsi olan, dörd düymə ilə bağlanan. *Dörddüyməli köynək.*

**DÖRDELEMENTLİ** *sif. kim.* Tərkibi dörd elementdən ibarət olan. *Dördelementli maddə.*

**DÖRDƏLLİ** 1. *zərf* Cəld, tələsik. *O, gecəgündüz dördəlli işləyir.* ◻ **Dördəlli yapışmaq (tutmaq)** – bərk-bərk tutmaq, əlindən buraxmamaq. *İşindən dördəlli yapışmaq.*

2. *sif. mus.* Dörd əllə ifa edilən (çalınan). *Royal üçün uyğunlaşdırılmış dördəlli pyes.*

**DÖRDƏM** *zərf* Dördayaq, dördnal, birnəfəsə, çaparaq. *Yasavulun kürən atı yellənərək qabağa çıxdı. At dağ yuxarı dördəm tullana-tullana qalxdı.* S.Rəhimov.

**DÖRDƏMƏL** *is.* Riyaziyyatda: cəm, çıxma, vurma, bölmə əməlləri.

**DÖRDGÖZ** 1. *sif.* Dördşəbəkəli, dördbölgülü, dörd gözü olan (ev, dükan, pəncərə və s.). *Dördgöz pəncərənin xəmirlənmiş kağızı qopur, küləkli qar içəriyə soxulur.* S.Rəhimov.

2. *is. məc. zar.* Gözlük taxan, gözlük gəzdirən, gözlüklü (adam). [Qədir:] *Sənin xəbərin yoxdur, səni Gəlinsultan çoxdan o dördgözə veribdir, ey!* Ə.Əbülhəsən. ☐ **Dördgöz etmək** – ayıltmaq, xəbərdar etmək. *Çünki Zülmət dəstəsinin arasında olan Midhətin Dəmirova tərəfdar çıxması .. Zülməti ayıldıb dördgöz etmişdi.* S.Rəhimov. **Dördgöz olmaq** – ayıq olmaq, sayıq olmaq, diqqətli olmaq; gözləmək, intizarda olmaq. [Salman:] *Məni götür oğulluğa, Rüstəm dayı, Pərşanı gözüm üstə saxlaram, – dedi və dördgöz olub Rüstəm kişiyə baxdı.* M.İbrahimov.

**DÖRDGÖZLÜ** 1. Bax **dördgöz**.

2. *sif.* Diqqətli, ayıq, sayıq.

3. *sif.* Dörd gözdən (hissədən, bölmədən, şöbədən), dörd otaqdan ibarət olan. *Dördgözlü körpü. Dördgözlü mənzil.*

**DÖRDGUŞƏ(Lİ)** *sif.* Dörd guşəsi (bucağı, tini) olan. *Dördguşəli daş.*

**DÖRDGÜL** *sif.* Dörd yanı bir-birinə bərabər olan, düzbucaq şəkilli; dördkünc. *Dördgül kərpic.*

**DÖRDGÜNLÜK** *sif.* Dörd gün davam edən, dörd gün tələb edən. *Dördgünlük səfər. Dördgünlük iş.* // Dörd gün nəzərdə tutan, dörd gün üçün olan. *Dördgünlük ehtiyat. Dördgünlük maaş.*

**DÖRDHECALI** *sif. dilç.* Dörd hecadan ibarət olan. *Dördhecalı söz.*

**DÖRDHƏDLİ** *sif. riyaz.* Dörd həddi olan. *Dördhədli ifadə.*

**DÖRDHİSSƏLİ** *sif.* Dörd hissədən ibarət olan.

**DÖRDİLLİK** *sif.* Dörd il müddətində olan, dörd il davam edən. *Dördillik müharibə. Dördillik fəaliyyət dövrü. Dördillik təhsil kursu.* // Dörd ili nəzərdə tutan. *Dördillik plan. Dördillik ərzaq ehtiyatı.*

**DÖRDKƏSİCİDİŞLİLƏR** *is. zool.* Gəmirici məməli heyvanlar yarımdəstəsi.

**DÖRDKÜNC(LÜ)** *sif.* Dörd küncü olan, dördbucaqlı, dördguşəli, yaxud dördbucaq şəklində olan. *Dördkünc bina. – Yaşıl məhəccərli dördkünc bağçada Nizaminin tuncdan tökülmüş miniatür heykəli qoyulmuşdu.* M.Hüseyn. *Sola və sağa açılan qapıların yanında ləmə kimi divara qazılmış dördkünclü işləmələr var idi.* M.İbrahimov. *Dördkünc həyətin ortasında dördkünc bir bağça, bağçanın ortasında yenə də dördkünc kiçik bir hovuz vardı..* Ə.Əbülhəsən.

**DÖRDQAT** *zərf* Dörd dəfə, dörd dəfə təkrar edilərək, dörd dəfə artırılaraq. *Məhsulu dördqat artırmaq. Bükərək dördqat etmək.* // İki dəfə qatlanmış. *Qara Kərəmoğlu kitabın içərisində dördqat bükülmüş rəngli xəritəni açdı.* M.İbrahimov.

**DÖRDQATLI** *sif.* Dörd qatı olan; dördmərtəbəli.

**DÖRDQƏLSƏMƏLİ** *sif. zool.* İki cüt qəlsəməsi olan.

**DÖRDQƏLSƏMƏLİLƏR** *is. zool.* İki cüt qəlsəməsi olan baş-ayaqlı molyusklar yarımsinfinin adı.

**DÖRDQIÇLI** bax **dördayaqlı**[1] 1-ci mənada.

**DÖRDQRAMLIQ** *sif.* Çəkisi, arıqlığı dörd qram olan.

**DÖRDQULPLU** *sif.* Dörd qulpu, dörd yerdən tutacağı olan.

**DÖRDLƏMƏ** bax **dördqat**.

**DÖRDLƏŞMƏ** "Dördləşmək"dən *f.is.*

**DÖRDLƏŞMƏK** *f.* 1. Miqdarca dörd olmaq, dördə çatmaq, dördə çevrilmək.

2. Hər sırada dörd nəfər durmaq, dörd-dörd durmaq.

**DÖRDLİTRLİ(K)** *sif.* Dörd litr tutan, həcmi dörd litr olan. *Dördlitrlik qab.*

**DÖRDLÜK** *sif.* 1. Ölçüsü dörd vahidə bərabər. *Dördlük taxta.*

2. Dörd rəqəmi ilə işarə olunmuş, dörd nömrəli, dörd xalı olan. *Dördlük kart.*

**DÖRDMƏRTƏBƏ(Lİ)** *sif.* Dörd mərtəbədən ibarət olan. *Dördmərtəbə(li) ev. – Onlar geniş bir küçədə, yeni stildə tikilmiş dördmərtəbəli uca bir binada yaşayırdılar.* A.Şaiq.

**DÖRDMİSRALI** *sif.* Dörd misradan ibarət olan. *Dördmisralı şeir.*

**DÖRDMOTORLU** *sif.* Dörd motoru olan, dörd motorla işləyən. *Dördmotorlu təyyarə.*

**DÖRDNALA** *zərf* b a x **dördayaq**[1] 2-ci mənada. *At dördnala qaçırdı. – ..Bir az yaxşı dinlə, hey qıya bir bax; Dördnala gəlirlər atlar çaparaq.* Ə.Cavad. *Baş aparan "atları" səyirdərək dördnala; Qaçışır, gülüşürlər hey şeypur çala-çala.* Ə.Cəmil. *O kimdir ki, atları; Çapar belə dördnala.* M.Seyidzadə.

**DÖRDNƏFƏRLİK** b a x **dördadamlıq**.

**DÖRDOXLU** *sif.* İki cüt oxu olan. *Dördoxlu yük vaqonu.*

**DÖR-DÖŞƏK** *is.* Yorğan-döşək, yatacaq ləvazimatı. *Bir cift yastıq, bir cift mütəkkə, bir cift dör-döşək .. tədarük görüləcəkdir.* R.Əfəndiyev.

**DÖRDPƏRDƏLİ** *sif.* Dörd pərdədən, dörd hissədən ibarət olan. *Dördpərdəli tamaşa* (*pyes*).

**DÖRDPİLLƏLİ** *sif.* Dörd pilləsi olan. *Dördpilləli pilləkən.*

**DÖRDPUDLUQ** *sif.* Dörd pud ağırlığında olan, yaxud dörd pud tutan. *Dördpudluq kisə.*

**DÖRDRƏQƏMLİ** *sif.* Dörd rəqəmdən ibarət olan.

**DÖRDRƏNGLİ** *sif.* Dörd rəngdə olan, dörd rəngdə çəkilmiş (çap olunmuş). *Dördrəngli plakat.*

**DÖRDSAATLIQ** *sif.* Dörd saat davam edən, dörd saat vaxt tələb edən. *Dördsaatlıq tənəffüs. Dördsaatlıq iş.*

**DÖRDSƏSLİ** *sif.* Dörd səslə ifa edilən, dörd səs üçün yazılmış. *Dördsəsli xor.*

**DÖRDSƏTHLİ** *sif.* Dörd səthi olan, dördtərəfli.

**DÖRDSİMLİ** *sif.* Dörd simi olan, dörd simlə çalınan. *Dördsimli musiqi aləti.*

**DÖRDSİNİFLİ** *sif.* Dörd sinfi olan. *Dördsinifli məktəb.*

**DÖRDTAKTLI** *sif. mus.* Dörd taktdan ibarət olan, dörd takt davam edən. *Dördtaktlı pauza* (*ara*).

**DÖRDTARLALI** *sif. k.t.* Dördtarlalıq əsasında aparılan. *Dördtarlalı əkin.*

**DÖRDTARLALIQ** *is. k.t.* Əkin yerinin (şumun) müəyyən ardıcıllıqla müxtəlif bitkilərlə əkilən dörd tarlaya ayrılması əsasında əkindəyişmə üsulu.

**DÖRDTARLI** *sif.* Dörd tarı olan. *Dördtarlı bina.*

**DÖRDTELLİ** b a x **dördsimli**.

**DÖRDTƏKƏRLİ** *sif.* Dörd təkəri olan; dördçarxlı. *Dördtəkərli araba.*

**DÖRDTƏRƏFLİ** *sif.* 1. Tərəfi dörd olan, dörd tərəfdə yerləşdirilmiş. *Dördtərəfli bazar. Dördtərəfli cisim* (*fiqur*).

2. Dörd tərəfin iştirakı ilə olan, dörd tərəf üçün məcburi olan. *Dördtərəfli müqavilə. Dördtərəfli pakt.*

**DÖRDTONLUQ** *sif.* Dörd ton ağırlığında olan. *Dördtonluq yük.* // Dörd ton tutan. *Dördtonluq yük maşını.*

**DÖRDÜNCÜ** 1. "Dörd"dən *sıra s. Dördüncü mərtəbə. Dördüncü sinif. Adına həftənin dördüncü günüdür. – Firidun dördüncü qatda işıqlı pəncərələri göstərərək dedi..* Mir Cəlal.

2. B a x **dördüncüsü**.

**DÖRDÜNCÜSÜ** *ara s.* Bir şeyi sayarkən dördüncünü, növbə ilə gələn dördüncü şeyi göstərmək üçün işlədilir. *Dördüncüsü budur ki...*

**DÖRDÜZLÜ** *sif. riyaz.* Dörd üzü olan. *Dördüzlü cisim.*

**DÖRDYANLI** *sif.* Dörd yanı olan. *Dördyanlı cisim.*

**DÖRDYAŞAR, DÖRDYAŞLI** *sif.* Dörd yaşı olan.

**DÖRDYERLİ** *sif.* Yatmaq, ya oturmaq üçün dörd yeri olan. *Dördyerli kupe. Dördyerli loja.*

**DÖRDYÜZİLLİK** *sif.* Dörd yüz ili tamam olmuş, üstündən dörd yüz il keçmiş, dörd yüz il sürən. *Dördyüzillik dövr.* // *is.* Dörd yüz illik bir dövr, dörd yüz il əvvəl olmuş bir hadisənin ildönümü. *Füzulinin anadan olmasının dördyüzilliyi.*

**DÖRDYÜZÜNCÜ** "Dörd yüz"dən *sıra s. Dördyüzüncü nömrə.*

**DÖŞ** *is.* 1. Bədənin, boyundan qarına qədər olan ön hissəsi; köks, sinə. *Döş qəfəsi. Döş əzələləri. – ..Ciyər sinənin içində olur ki, qutu kimi şeydir. Onun qabaq tərəfi döş sümüyü və qabırğalardır.* H.Zərdabi. *Ayna islaq başını Ayazın döşünə qoydu.* Ə.Məmmədxanlı. // Bədənin, ciyərlərin və ürəyin yerləşdiyi həmin nahiyə. *Döşü ilə dərindən*

*nəfəs almaq.* – [Əvvəlinci azarlı:] *..Bax, hərdənbir döşümün burasından ki bir ağrı tutur, dəxi qoymur nəfəsimi alım.* C.Məmmədquluzadə. ◻ **Döş(ün)ə salmaq** – aşağı sallamaq, uzatmaq. *..Dərviş başını döşünə salıb, qaşqabağını qara bulud kimi töküb, bir xeyli zamandan sonra uyqudan oyanmış şir kimi saçlarını silkələyib, qaşqabağını yuxarı çəkib başladı.* A.Divanbəyoğlu. // At və s. heyvanların boynu ilə qabaq ayaqlarının yuxarısı arasındakı ön hissə. *Atın döşü.*

2. Məmə, əmcək. *Bizə döşlərindən süd verən ana; Bizi tapşırmışdır Azərbaycana!* S.Vurğun. ◻ **Döş vermək, döşə salmaq** – əmizdirmək, süd vermək. **Döşdən ayırmaq** – süddən ayırmaq, süddən kəsmək. [Tükəz:] *Südəmər tifilləri döşümüzdən ayırırıq.* Ə.Əbülhəsən. // Məməli heyvanlarda: əmcək, yelin. *Sağımdan əvvəl inəyin döşünü yaş dəsmalla silmək lazımdır.*

3. Paltarın, köynəyin döşü örtən hissəsi. *Köynəyin döşü. Döş cibi.* – [Cavad] *ayağa qalxdı, yarımkürkünün döşünü düymələdi.* Ə.Vəliyev.

4. Dərin, təpənin yamacı. [Nəbi] *özünü bir döşə vurub düdük çalırdı.* "Qaçaq Nəbi". *..Bir dağın döşündə, yolun qırağında bir böyük köç gördüm.* A.Divanbəyoğlu. *Döşlərdə dəniz kimi dalğalanan yaşıl otlar .. onun könlünə dərin bir sevinc verirdi.* M.Hüseyn.

5. Ümumiyyətlə, bir şeyin önü, qarşısı, qabağı. ◻ **Döşünə qatmaq** – qabağına qatmaq. *Qatardı at döşünə, bax, onların cümləsini.* Aşıq Əli.

6. Hafizə, yaddaş mənasında. *Hamısını döşündən deyir.* – [Hüseynəli əmi] *Təbrizin 75 illik tarixini döşündə toplamışdı.* M.S.Ordubadi.

◊ **Döş gərmək** – özünü qorxmadan qabağa verərək mərdcəsinə qorumaq; sinə gərmək, köks gərmək; müqavimət göstərmək. *Onun hər baxışında çəkilməz bir müsibətə qarşı döş gərdiyi və bundan da müdhiş bir ağırlıq hiss etdiyi aydınca sezilirdi.* M.S.Ordubadi. **Döş vermək** – b a x **döş gərmək**. **Döş vurmaq** – 1) *məc.* gücünü sınamaq, zor gəlmək, həmlə etmək. *Çay əvvəlcə gücünü sınayırmış kimi bəndə bir döş vurdu.* Ə.Vəliyev; 2) dindarların məhərrəmdə əlləri ilə öz sinələrinə vurmaq mərasimi. *Əhvalat vaqe olur məsciddə, .. varlılar oturublar minbər yanında, fəqir-füqəra döş vururlar.* M.Əliyev. **Döşə çəkmək** – özünə yaxınlaşdırmaq. **Döşü atlanmaq** – 1) tövşümək, sinəsi tutulmaq. *Səlim döşü atlana-atlana* (z.) *raykom katibinə şikayətləndi.* S.Rəhimov; 2) lovğalanmaq; çox yersiz fəaliyyət göstərmək. **Döşü gəlmək** – 1) döş xəstəliyinə tutulmaq; 2) döşü şişmək, iltihab etmək (qadınlarda). **Döşünə çəkmək** – 1) qucaqlamaq; 2) himayə etmək, himayəsi altına almaq, saxlayıb bəsləmək. *Mənim həmişə fikrim bu idi ki, qardaşım oğlunu döşümə çəkim və bircə nəfər, sizdən ayıb olmasın, qızımı da ona verim.* Ə.Haqverdiyev. **Döşünə düşmək (yatmaq)** – xoşuna gəlmək, işinə gəlmək, ürəyinə yatmaq, xoşlamaq. *..Tarın çaldığı hava döşünə düşmədi, qırmancın çaldığı nəva döşünə düşər, əlləzinəni əzbərdən oxuyarsan!* Ə.Məmmədxanlı. **Döşünə vurmaq (döymək)** – lovğalanmaq, özünü öymək, öyünmək. *Adım çəkildikcə eldə, obada; Döşümə döymədim, lovğalanmadım.* S.Rüstəm. **Döşünü qabartmaq** – lovğalanmaq, təşəxxüslənmək.

**döş-döşə: döş-döşə gəlmək** – 1) qarşılaşmaq, üz-üzə gəlmək, qabaq-qabağa çıxmaq. [Slavçinski:] *Biz Nəbini açıqda döş-döşə gəlməklə tuta bilməyəcəyik.* "Qaçaq Nəbi". [Paşa:] *Əgər bizim aşıqla döş-döşə gəlib onu bağlaya bilsən, səni azad edərəm.* "Aşıq Qərib"; 2) döyüşmək, güləşmək, mübarizəni mərdcəsinə açıq şəkildə aparmaq. *Əvvəllər beləydi: durub döş-döşə; Çıxardı düşmənlər açıq döyüşə...* B.Vahabzadə.

**DÖŞALTI** *sif.* Döşün altında, alt tərəfində olan. *Döşaltı dəri.*

**DÖŞBAĞI** *is.* 1. Qadınların sinələrinə taxdıqları zinət bağı.

2. Atın, ulağın döşündən keçib yəhəri, palanı saxlayan bağ. *Döşbağı yəhəri dala getməyə qoymur.*

**DÖŞ-BAŞ** *top.* b a x **döş** 1 və 2-ci mənalarda. *Döş-başı açıq. Döş-başını örtmək.* – *Döş-baş .. bilinməsə, gözə dəyməsə, yaxşıdır.* Ə.Əbülhəsən.

**DÖŞDƏN** *zərf* Əzbərdən, sinədən, hafizədən, yazısız. *Döşdən demək. Döşdən oxumaq.*

**DÖŞDƏYMİŞ** *sif. dan*. Qudurmuş, qızmış, yaralanmış.

**DÖŞƏK** *is*. Davamlı parçadan hazırlanmış və üzərində yatmaq üçün içərisi yun, pambıq və s. yumşaq şeylə doldurulmuş uzun yastı kisə. [Dərviş:] *..Göy ot döşəyim, qara daş yastığım, enli yarpaqlar yorğanım idi.* A.Divanbəyoğlu. // Döşəkcə. [Xudayar bəy] *çox təəccüb elədi ki, haman gördüyü qoca kişi əyləşib yuxarı başda döşəyin üstə*. C.Məmmədquluzadə. *Arvad kişini götürüb pəncərənin qabağında döşəyin üstə oturtdu.* Çəmənzəminli. [Dilbərin] *yaşı yüzü çoxdan ötmüş qoca nənəsi Həcər isə döşək üstündə oturaraq yun darayırdı*. Ə.Sadıq.

◊ **Döşəkdə yatmaq** *məc*. – xəstə olmaq, xəstələnmək. *İmamverdi baba döşəkdə yatırdı, azardan çox zəif düşmüşdü.* S.S.Axundov.

**DÖŞƏKAĞI** *is.* Döşəyin üstündən salınan ağ; mələfə. [İsmayılzadə] *nazik yun yorğanları qaldırıb bir-bir döşəkağılarına baxdı..* M.Hüseyn. [Qərənfil] *çarpayıya təzə döşəkağı çəkdi.* İ.Əfəndiyev.

**DÖŞƏKAĞILIQ** *sif.* Döşəkağı üçün yarayan; mələfəlik. *Döşəkağılıq kətan*.

**DÖŞƏKCƏ** *is.* Üstündə bir adam oturmaq üçün kiçik döşək. *Evin yuxarı başında uşaqların atası üçün xüsusi döşəkcə salınardı.* H.Sarabski. *Göy döşəkcə üstündə çöməlib oturan araqçınlı molla cəld ayağa qalxıb əmmaməsini başına qoydu.* Mir Cəlal.

**DÖŞƏKLİK** *sif.* Döşək üçün yarayan. *Döşəklik yun*.

**DÖŞƏKÜZÜ** b a x **döşəkağı**. *Təzə döşəküzü gətirib bu dəm; Anam çarpayıda yer açdı mənə.* Z.Xəlil.

**DÖŞƏKÜZÜLÜK** *sif.* Döşəküzü üçün yarayan. *Döşəküzülük parça*.

**DÖŞƏLİ** *sif.* Döşənmiş, fərş salınmış, müxəlləfatlı; səliqəli. *Durna bacının kənddə güzəranı babat olsa da, bu cür yeni mədəni qaydada, döşəli evdə ilk dəfə yaşamağa başlayırdı.* Ə.Sadıq.

**DÖŞƏMƏ**[1] 1. "Döşəmək"dən *f.is.*

2. *is.* Otağın və s.-nin alt tərəfini örtən taxta, torpaq və s. *Otağın döşəməsi. Torpaq döşəmə. Parket döşəmə. Kərpic döşəmə. Mərmər döşəmə. – Bu ibadətgahın zəmini, yəni döşəməsi bir neçə qatdır və dərya tərəfdən bəndləri vardır.* H.Zərdabi. *Pəncərədə ipək pərdə, döşəmədə xalı yoxdur*. R.Rza. // B a x **döşənəcək**.

3. *is.* Küçələrə döşənmiş daş və s. // Daş və s. döşənmiş küçə.

**DÖŞƏMƏ**[2] *is. aşp*. Plovun altına qoyulub bişirilən ət, kişmiş və s.-dən ibarət qara (xuruş). *Plovun döşəməsi*.

**DÖŞƏMƏK** *f.* 1. Salmaq, sərmək, bir şeylə üstünü örtmək. [Cahangir bəy:] *İldırım, sən də yapıncıları döşə yerə...* N.Vəzirov. *Tərgül qazanın altında od yandırdı, samovara köz saldı, masanın üstünə ütülənmiş ağ süfrə döşədi.* Ə.Vəliyev. // Yerə xalça, palaz, həsir və s. salmaq. *Evi döşəmək. Otağı döşəmək. – ..Onlar da durub, mənim yanımda şeylərini açıb evi döşəməyə başladılar.* M.S.Ordubadi. *Həyətdə toyxana tikib, xalı, xalça, palaz, fənər tanış evlərdən yığıb toyxananı döşərlər.* R.Əfəndiyev. // Qoymaq. *Rüxsarə cavab vermədən çarpayıya yaxınlaşıb bankaları bir-bir Sübhanverdizadənin kürəyinin o biri yarısına döşədi.* S.Rəhimov.

2. *məc. dan*. Vurmaq, döymək, çəkmək. *Fərraş sağa-sola çubuqdan döşəyirdi.* Çəmənzəminli.

3. *məc. dan*. Bərk tənqid etmək. *Müşavirədə ona yaman döşədilər.* İ.Əfəndiyev.

4. *məc. dan*. Demək, söyləmək (düşünmədən, fikirləşmədən), danlamaq. *Ağzına gələni döşəmək. – Məşədi Qulam məlumat vermək istəyən Cavahirin sözünü kəsib, döşəməyə başladı.* T.Ş.Simurq. // Çox danışmaq, usandıracaq dərəcədə danışmaq, durmadan danışmaq (bəzən "cəmdəyinə", "qabırğasına" sözləri ilə). [Bürcəliyev:] *Bu qoca bizə leksiya açıb, hey döşəyir.* S.Rəhimov.

5. *məc. vulq*. Acgözlüklə, iştaha ilə, doyunca yemək. *Xanım gündə üç yol plov döşəyir.* Çoban Əfqan.

**DÖŞƏMƏLİ**[1] *sif.* Döşəməsi olan, üstü bir şeylə döşənmiş, örtülmüş. *Döşəməli ev. Daş döşəməli küçə. Taxta döşəməli eyvan. – ..Gecə idi, ev sahibinin qızı daş döşəməli xiyabanla gəlib odun anbarından odun götürmək istəyirdi.* M.S.Ordubadi. *Məhbuslar sement döşəməli dalana yığıldılar*. Mir Cəlal.

**DÖŞƏMƏLİ**[2] *sif. aşp*. Döşəmədən ibarət qarası (xuruşu) olan. *Döşəməli aş*.

**DÖŞƏMƏLİK**[1] *sif.* Döşəməyə yarayan. *Döşəməlik taxta.*

**DÖŞƏMƏLİK**[2] *sif.* Döşəmə üçün yararlı. *Döşəməlik ət.*

**DÖŞƏMƏPLOV** *is. aşp.* Qarası döşəmədən ibarət plov. – *Yolda məşədinin yadına düşdü ki, sübh üç girvənkə ət alıb və sifariş edibdir ki, əti abguşt bişirib günorta uşaqlar suyuna çörək doğrayıb yesinlər və ətini saxlayıb axşama döşəməplov bişirsinlər.* Ə.Haqverdiyev.

**DÖŞƏMƏSİLƏN** *is.* 1. Döşəməni silib təmizləmək üçün elektrik şotkası. [Azər:] *Döşəməsilən, paltaryuyan, elektrik çayniki, radio – hamısından başım çıxır*. M.İbrahimov.

2. Döşəməni silib təmizləməklə məşğul olan adam.

**DÖŞƏMƏSÜRTƏN** b a x **döşəməsilən** 2-ci mənada.

**DÖŞƏNƏCƏK** *is.* 1. Yerə döşənilən, salınan hər şey (xalça, palaz və s.). *Otaqda bol döşənəcək var*.

2. B a x **döşənək**.

**DÖŞƏNƏCƏKLİ** b a x **döşənəkli**.

**DÖŞƏNƏK** *is.* Yerə, alta salına biləcək hər şey. *Həsir döşənək. Küləş döşənək. Malqaranın döşənəyi vaxtında və müntəzəm surətdə dəyişdirilməlidir*.

**DÖŞƏNƏKLİ** *sif.* Döşənmiş, müxəlləfatla təchiz olunmuş, səliqəyə salınmış, bəzənmiş. *Qoy otursun döşənəkli otaqda; Telli bir gəlinin qonağıyam mən.* Aşıq Rəcəb.

**DÖŞƏNİLMƏ** "Döşənilmək"dən *f.is.*

**DÖŞƏNİLMƏK** *məch*. b a x **döşənmək** 1-ci mənada.

**DÖŞƏNMƏ** "Döşənmək"dən *f.is.*

**DÖŞƏNMƏK** 1. *məch. S*ərilmək, salınmaq, üstünə salınmaq. *Rəxtxabı döşəndi, yatdı hərif; Günbəgündən vücudu oldu zəif.* S.Ə.Şirvani. *Həyətdə palaz döşənib samovar qurulmuşdu.* Çəmənzəminli. *Döşəndi süfrə yerə, xonçeyi-pilov gəldi; Qarınlar oldu çırağan o dadlı nemətlə.* M.Möcüz. *Mağaranın içi yumşaq ağac qabıqları ilə döşənmişdi.* A.Şaiq.

2. *t-siz.* Sərələnmək, yerə sərilmək, yayılmaq, uzanmaq. [Qivami:] *Nizami özgə vaxt bu ağacın kölgəsinə döşənib axşama kimi yazardı..* M.Hüseyn. // Torpağa (ayağına) düşüb yalvarmaq. *Mən aşıq, ağla barı; Gözlərim, ağla barı! Ayrılıq yəqin oldu; Yar, döşən, ağla barı.* Sarı Aşıq.

3. *t-li. dan.* "Üstə", "üstünə" sözləri ilə – acgözlüklə, iştaha ilə yeməyə başlamaq. *Molla, hərçibadəbad deyib, girir dükana, bir tərəfdən döşənir halvanın üstünə.* "M.N.lətif.". [Şahqulu:] *Düyü əldə, yağ əldə, ağaları ver yuxuya döşən plov üstə.* N.Vəzirov.

4. *t-siz. dan.* Qaçmaq, getmək, yüyürmək mənasında. *Adamlar piyada, ceyranın dalından döşəndilər.* Mir Cəlal.

**DÖŞƏNMİŞ** 1. "Döşənmək"dən (1 və 2-ci mənalarda) *f.sif. Orada çocuğun uzanmış olduğu yatacaqdan və yerə döşənmiş cırıqcırıq parça palazlardan başqa artıq bir şey gözə çarpmırdı.* T.Ş.Simurq. *Qadir .. yastı daş döşənmiş həyətə çıxaraq əzazil Əminənin əmrini yerbəyerli icra etməyə başladı.* Ə.Əbülhəsən.

2. *sif.* Örtülmüş. *İri kələ-kötür ətəkləri qaratikan kolları ilə döşənmiş dağlar arasından yuxarı qalxdıqca təbiət və hava bütün başqalaşır.* A.Şaiq.

**DÖŞƏNTİ** *is.* Döşənilən hər hansı bir şey. *Otaq döşəntisi*.

**DÖŞƏTDİRİLMƏ** "Döşətdirilmək"dən *f.is.*

**DÖŞƏTDİRİLMƏK** "Döşətdirmək"dən *məch.*

**DÖŞƏTDİRMƏ** "Döşətdirmək"dən *f.is.*

**DÖŞƏTDİRMƏK** "Döşətmək"dən (1-ci mənada) *icb. Sən, Sənəm, boş otağı döşətdir, otur orada.* Ə.Haqverdiyev.

**DÖŞƏTMƏ** "Döşətmək"dən *f.is.*

**DÖŞƏTMƏK** *icb.* Döşənək saldırmaq. *Böyükxanım qonaq otaqlarını döşədib zinət verdirmişdi.* M.S.Ordubadi. *Söyüd ağacının kölgəsinə bir palaz döşədib orada rahatlandım.* S.Hüseyn.

**DÖŞƏYATAN** *sif.* Ürəyəyatan, xoşagələn, xoşlanılan, cazibəli. *Döşəyatan bir şey*.

**DÖŞLƏMƏ** "Döşləmək"dən *f.is.*

**DÖŞLƏMƏK** *f.* 1. Döşü ilə itələmək, döş vurmaq. *Cücələr bir-birini döşləyərək səpdiyim dəni dimdiklərdi.* A.Şaiq.

2. Döşündən, yaxasından yapışmaq.

**DÖŞLƏŞMƏ** "Döşləşmək"dən *f.is.*

**DÖŞLƏŞMƏK** *qarş.* Üz-üzə vuruşmaq, savaşmaq, döş-döşə gəlmək, əlbəyaxa ol-

maq, mübarizə etmək. *O, mütləqa Dəmirovla üz-üzə gəlməli idi, onsuz da onu bu arada saymayan adamla istər-istəməz döşləşməli idi.* S.Rəhimov.

**DÖŞLÜ** *sif.* 1. Döşü enli və iri olan. *Döşlü at.*

2. *məh. dan.* Qoçaq, qorxmaz, dikbaş. *O, yaxşı bilirdi ki, Qəhrəman məktəb uşaqlarının döşlüsü və hazırcavabıdır.* S.Rəhimov.

**DÖŞLÜK** *is.* 1. Paltarı təmiz saxlamaq üçün üstdən geyilən qolsuz önlük. *Dəllək döşlüyü. Döşlüyün ətəyi. Uşaq döşlüyü. – Restoran sahibi də başında araqçın, döşündə döşlük kürənin arxasında durub, .. xörəkləri çəkib verir.* Ə.Haqverdiyev. [Usta Ağabala] *cəld çərməyi tullayıb, döşlüyü döşündən qopartdı.* Çəmənzəminli. *Qərənfil xala keçən il tikdirdiyi çit döşlüyü ilə yapışıb, qazanı yerə düşürdü.* Ə.Vəliyev.

2. Əsasən bədənin döş hissəsini örtmək üçün altdan geyilən qolsuz paltar.

**DÖŞLÜKLÜ** *sif.* Döşlük geymiş. *Döşlüklü aşpaz. – İki nəfər ağ döşlüklü gənc qız nömrə üçün kağız doğrayırdı.* Mir Cəlal.

**DÖŞOTU** *is. bot.* Boruvari çiçəkləri olan çoxillik ot bitkisi.

**DÖŞÜAÇIQ** *sif.* və *zərf* Sinəsi açıq. *Bu gecə Maşo Sonanın yatacaq otağına gəlib onu döşüaçıq yatmış gördü.* N.Nərimanov.

**DÖŞÜDOLUSU** *zərf, dan.* Ürəyini boşaldaraq; çoxlu, ətraflı. *Memar ilk qələbədən döşüdolusu məlumat verirdi.* S.Rəhimov.

**DÖŞÜQARA** *sif.* Döş tərəfi, döşü qara olan. *Döşüqara quş.*

**DÖŞÜODLU** *sif.* Ürəyində çoxlu deyiləsi sözü olan, ürəyi sözlə dolu olan.

**DÖŞÜRMƏ** "Döşürmək"dən *f.is.*

**DÖŞÜRMƏK** *f.* Toplamaq, cəm etmək, yığmaq, yığışdırmaq. *Dərviş Məstəlişah cəld taxta parçaları döşürüb, töküb xurcuna, atır çiyninə, girir yükün qabağından asılan pərdənin dalısına, gizlənir.* M.F.Axundzadə. *Şərqli uşaqlar .. qapı-bacanızda konserv qutuları, papiros kötükləri döşürmək istəməyir.* O.Sarıvəlli. // Yığmaq, dərmək, dərib toplamaq. *Bir tərəfdən də qadınlar, çocuqlar otların arasından çiyələk döşürüb orada-burada qurumuş otlardan qotman vururlar.* A.Şaiq. *Sadə biyanlardan döşürüb dərdik.* S.Vurğun. *Adam var dolanar səhranı, düzü; Adam var döşürər gülü, nərgizi.* Aşıq Abbas.

**DÖŞÜRÜLMƏ** "Döşürülmək"dən *f.is.*

**DÖŞÜRÜLMƏK** *məch.* Yığılmaq, toplanmaq.

**DÖŞÜYASTI** *sif.* Döşü yastı olan, döşü inkişaf etməmiş.

**DÖŞÜZƏİF** *sif.* Ciyərləri zəif, ciyərləri sağlam olmayan. *Döşüzəif adam.*

**DÖVLƏT¹** *is.* [*ər.*] Ölkənin hakim sinfinin, mövcud idarə üsulunu qorumaq və başqa siniflərin müqavimətini aradan qaldırmaq məqsədini daşıyan siyasi təşkilatı, habelə bu cür siyasi təşkilatı olan ölkənin özü. *Dövlət hüdudları. Dövlət quruluşu. Dövlət idarələri. Dövlət gerbi. Yaxşı ki, hökumət, yaxşı ki, dövlət; Yenə sahib durur atılmışlara!..* B.Vahabzadə.

**DÖVLƏT²** *is.* [*ər.*] Sərvət, mal, mülk, pul və b. maddi nemətlərin məcmusu. *Məgər azdır bu xalqda dövlət? Çoxdu dövlət və leyk yox himmət.* S.Ə.Şirvani. *..Heydər atasının dövlətinə tək oldu malik və işi, gəldikcə başladı tərəqqi etməyə.* C.Məmmədquluzadə. [Uğur:] *Mən dövlət ona deyirəm ki, qızıl zəmiləri dərya kimi dalğa vurub həyatı öz ağuşuna alsın.* İ.Əfəndiyev.

◊ **Dövlət hüququ** – ölkənin ictimai və dövlət quruluşunu, dövlət orqanlarının təşkilat sistemi və prinsiplərini, həmçinin dövlət daxilində vətəndaşların hüquq qaydalarını təsbit edən hüquq normalarının məcmusu. **Dövlət imtahanları** – ali və orta ixtisas məktəblərində buraxılış imtahanları. **Dövlət quşu** – 1) nağıllarda: əfsanəvi və mövhumi bir quşdur ki, padşah seçilən zaman uçurdulur və hər kimin başına qonsaydı, onu padşah edərlərmiş. *Dəli başına dövlət quşu.* (Ata. sözü); 2) bəxt, tale, səadət rəmzi. *O, bir dövlət quşudur ki, hər eyvana uçub qonmaz.* S.Vurğun. **Dövlətin(iz)dən** *köhn.* – sayən(iz)də, himayən(iz)də, iltifatın(ız)dan mənasında hörmət, ehtiram, təvazö ifadəsi. *Dövlətindən pis deyiləm. – Dövlətindən yetdik nanü naməyə; Düşdüm indi cad və qatıq yeməyə.* M.V.Vidadi. [Məşədi İbad:] *Sənin dövlətindən kefim çox kökdür.* Ü.Hacıbəyov.

**DÖVLƏTİ** *sif.* [*ər.*] Dövlətə aid, dövlətə məxsus. *Zeynal dövləti müəssisələrin birində orta bir vəzifə daşıyırdı.* S.Hüseyn. // Dövlət üçün, dövlət nöqteyi-nəzərindən əhəmiyyəti olan. *Dövləti məsələ.* // Dövlət tərəfindən görülən. *Dövləti tədbirlər.*

**DÖVLƏTLƏNDİRMƏ** "Dövlətləndirmək"dən *f.is.*

**DÖVLƏTLƏNDİRMƏK** *f.* Dövlətli etmək, dövlət sahibi etmək, varlandırmaq, sərvətləndirmək, dövlətini daha da artırmaq.

**DÖVLƏTLƏNMƏ** "Dövlətlənmək"dən *f.is.*

**DÖVLƏTLƏNMƏK** *f.* Dövlət sahibi olmaq, dövlətli olmaq, zənginləşmək, varlanmaq. [Niyaz:] *Kasıb dövlətlənəndə özünə xoşbəxt deyər.* Ə.Haqverdiyev. *Dünənki və bugünkü hərəkəti dövlətlənmək yolunda Allahqulunun heç nədən çəkinməyəcəyini sübut edirdi.* Ə.Əbülhəsən. *O saat atası dövlətlənər, onu hörmət, ehtiramla bu məktəbə qəbul eləyərlər.* S.Rəhman.

**DÖVLƏTLİ** *sif.* Böyük mülk və sərvətə sahib olan, çox varlı; sərvətdar, zəngin. *Nəinki Naməlsəm məhəlləsində, bəlkə bütün kənddə, uyezddə dəxi bundan dövlətli, zəngin adam tapılmazdı.* N.Nərimanov. // İs. mənasında. *Dövlətliyə yaltaqlana bilmərəm; Qəmli ikən yalan yerə gülmərəm.* M.Ə.Sabir. [Sitarənin] *mərhum atası Bakının məruf və tanınmış bir dövlətlisi idi.* S.Hüseyn.

**DÖVLƏTLİLİK** *is.* Dövlətli adamın vəziyyəti; varlılıq, zənginlik, pulluluq, çoxlu mal və pul sahibi olma. *İndi dünyada qayda belədir ki, birisi ucadan alçağa enə, dövlətlilikdən kasıblığa düşə, söhbəti həmişə aparıb çıxardacaq keçən günlərinə.* C.Məmmədquluzadə.

**DÖVLƏTMƏND** *sif.* [*ər.* dövlət və *fars.* ...mənd] *köhn.* Dövlətli, varlı, dövlət sahibi. *Keçən həftə müsəlman qəzetlərində yazılmışdı ki, İrəvan şəhərində bir möhtərəm və dövlətmənd şəxs vəfat edib.* C.Məmmədquluzadə. *Dedi xatun ki: – Söylə ey fərzənd; Noldu kim, olduq indi dövlətmənd?* M.Ə.Sabir. *Senat isə ibarət idi alinəsəb, dövlətmənd .. əşxasın icmaindən.* F.Köçərli.

**DÖVLƏTPƏRƏST** *sif.* [*ər.* dövlət və *fars.* ...pərəst] Dövlət sevən, varlanmağa can atan.

**DÖVLƏTPƏRƏSTLİK** *is.* Varlanmağa, dövlətlənməyə can atma.

**DÖVLƏTSİZ** *sif.* Dövləti, sərvəti olmayan.

**DÖVLƏTSİZLİK** *is.* Dövləti**,** sərvəti olmama.

**DÖVR**[1] *is.* [*ər.*] 1. Dolanma, hərlənmə, fırlanma; bir şeyin öz oxu ətrafında hərəkəti. □ **Dövr etmək** – 1) bir şeyin ətrafında hərlənmək, fırlanmaq, dövrəvi hərəkət etmək. *Hələ dan ulduzu batmayıb, ərşi-fələkdə öz dövrünü edirdi.* A.Divanbəyoğlu. *Hərlənib dövr edən yerlər, fələklər; Bu səsi hər zaman eşidəcəklər.* M.Rahim. // Dolaşmaq, dolanmaq, gəzmək. *Bazarı dövr edib mənzilə qayıdan zaman övrətə rast gəldim..* N.Vəzirov; 2) dövrə vurmaq. *Humay kimi dövr edərəm havada; Babam öldü, yetim qaldım yuvada.* Qurbani. *..Tağı əmi kimi quşu ağaca buraxıb çağırmağa cürət edə bilmirdim. Qorxurdum ki, dövr edib havaya qalxsın, tuta bilməyim.* S.S.Axundov; 3) dövran etmək, dövrəvi şəkildə hərəkət etmək. *Dərya və qeyri yerlərdə mövcud olan sular daima buxar olaraq dövr edən havaya qarışır, yuxarı qalxır, bulud və duman olur.* H.Zərdabi; 4) yaşamaq, dövran sürmək. *Zimistanda dövr edərdin; Yaz, bahara boyan, könül!* "Koroğlu"; 5) *məc.* düz gəlmək, müvafiqət etmək. **Dövr qılmaq** *klas.* – b a x **dövr etmək** 5-ci mənada. *Fələk, muradım ilə dövr qılmadın bir gün.* S.Ə.Şirvani. **Dövr vurmaq** – b a x **dövrə vurmaq** ("**dövrə**"də). [Ağca xanım] *bir-iki dövr vurandan sonra, Qaraca qızı çağırdı, o da dərhal sıçrayıb ortalığa girdi.* S.S.Axundov. **Dövrə çıxmaq** – gəzmək, gəzişmək, dolanmaq, gəzməyə çıxmaq. *Bir xəbər də budur ki, pəncşənbə günü dövrə çıxmışdım, Quba meydanında dörd nəfər dərvişin mərəkə qurduğunu gördüm...* N.Vəzirov. // Bir şeyin ətrafında, yaxud öz oxu ətrafında olan hərəkətin hər dövrəsi; bir dəfə dolanması. *Təkərin dövrü.*

2. Zamanın hər hansı bir cəhətdən səciyyəvi olan böyük, ya kiçik qismi. *İntibah dövrü. Feodalizm dövrü. İnqilabi dövr. Müharibədən sonrakı dövr. İnkişaf dövrü. – Gənc dostum, bütün millətlər öz tarixində cəhalət dövrünü sürmüşdür.* S.S.Axundov.

*Məmmədquluzadənin 40 ilə yaxın ədəbi və 20 ildən artıq davam edən jurnalistlik fəaliyyəti "imperializm inqilabları" dövrünə təsadüf edir.* M.İbrahimov. // Çağ, zaman, vaxt. *Uşaqlıq dövrü. Cavanlıq dövrü. Tələbəlik dövrü. – Həsən bəy Zərdabi, dövrünün qabaqcıl adamı və Azərbaycan torpağının atəşin vətənpərvəri idi.* M.İbrahimov. ☐ **Dövri-fələk** *klas*. – b a x **dövr(i)-zaman** 2-ci mənada. *..Bu keçən gün elədim dövri-fələkdən ahü-zar.* Aciz. **Dövri-gərdun** *klas*. – b a x **dövr(i)-zaman** 2-ci mənada. **Dövri-qədim** – qədim dövr. *Vətən zindan olub dövrü-qədimdən, Vətənin ən böyük oğullarına.* B.Vahabzadə. **Dövr(i)-zaman** *klas*. – 1) dövr, zəmanə, vaxt. *Bu dövr-zamanda beş gün kişinin; Bir yaxşı vəfalı yarı gərəkdir.* Q.Zakir. *..Bu necə dövr-zamandır ki, işim ahü-fəğandır..* M.Ə.Sabir; 2) *məc.* bəxt, tale, qədər. *Kibrü qürurdən, – dedi, – en, enmədim; Endirdi indi dövri-zəmanə yavaş-yavaş.* Q.Zakir.

3. Bir şeyin, xüsusən, xəstəliyin inkişafında mərhələ, pillə. *Vərəmin ikinci dövrü. Xəstəliyin birinci dövrü qorxuludur.*

4. *məc. klas*. Çevrə, dairə, dövrə, ətraf. *Nə xoşdur arizin dövründə zülfi-ənbərəfşanın.* Füzuli. *Bu ümid ilə ki, qəmzəndən alam kamidilim; Düzülüb gözlərivin dövrünə mərdüm səf-səf.* S.Ə.Şirvani. *Şəm tək göz yaşım axmazdı qəmindən gecələr; Dövri-ruyindəki pərvanələr ağlatdı məni.* Ə.Vahid.

**DÖVR**[2] *is.* Məclisin baş tərəfi, hörmətli və şərəfli sayılan yeri.

**DÖVRAN** *is.* [*ər.*] 1. Zaman, zəmanə, dövr, vaxt, çağ. *Doğru derlər, hər zaman bir aşiqin dövranıdır.* Füzuli. *O imiş xahişi əvvəl anın; Şair ayinəsidir dövranın.* A.Səhhət. *Azad bir dünyanın, böyük bir elin; Xoşbəxt bir dövranın övladıyıq biz.* Ə.Cəmil.

2. Dövr; dövr etmə, dairəvi şəkildə cərəyan etmə, dolanma. *Qan dövranı.*

3. *məh.* Tale, qədər mənasında.

4. *etnoqr.* Toy məclislərində camaatın dövrə vurub oturması. // Toyda və s.-də çalğıçılar, xanəndələr üçün camaatdan toplanan pul. [Toy] *gecəsi oxuyub-çalandan sonra qaval gəzdirib dövran yığarlar.* R.Əfəndiyev.

◊ **Dövran dolanmaq** – vaxt gəlib keçmək, başa çatmaq, dövr vurub qurtarmaq. *Heç bilmədim dövran necə dolandı; Yandı cismim, atəşlərə qalandı.* M.V.Vidadi. *Bu dövran dolanıb, zəmanə dönə; Tanrının kərəmi olaydı mənə.* Q.Zakir. **Dövran etmək (eyləmək)** – 1) dövr etmək, fırlanmaq, dövrəvi şəkildə hərəkət etmək. *Damarlarda qan dövran edir. Su borularda dövran edir;* // məc. mənada. *Hüsn içində görməmiş mislin fələk; Buncə dövranı ki, dövran eyləmiş.* Nəsimi. *Bu çərxi-fələk tərsinə dövran edir imdi.* M.Ə.Sabir; 2) yayılmaq, intişar etmək, ağızdan-ağıza keçmək, dolaşmaq. *Bir gün şəhərdə belə şayiələr dövran edirdi ki, guya üsulilər ilə şeyxilərin davası olacaq.* Çəmənzəminli. **Dövran qurmaq** – büsat qurmaq, təntənə düzəltmək, şənlik düzəltmək. *Çənlibeldə qurub dövran; Bir tutaydım toyun, Eyvaz!* "Koroğlu". **Dövran sürmək** – yaşamaq, həyat sürmək, həyat keçirmək, gün keçirmək. *..Hər məhəllənin xalqı xüsusi bir yolla dövran sürürdü.* N.Nərimanov. *Ağayar həyatda çox yaxşı günlər görmüş, gözəl dövranlar sürmüşdü.* Ə.Əbülhəsən. *Orada neçə yüz, neçə min insan; Yaşayıb, yaradıb, dövran sürəcək.* Z.Xəlil. **Dövran vurmaq** – dövrə vurmaq, dövrə gəzmək, dövrə vurub gəzmək. *Qurbani dövran vurub, saz döşündə gördü ki, Pəri xanım pəncərənin lap qabağına gəlib.* "Qurbani".

**DÖVRƏ** *is.* 1. Çevrə, dairə. *Təkərin dövrəsi.*

2. Ətraf, həndəvər, yan; bir şeyin dışarıdan və ya içəridən dörd tərəfi. *Dağın dövrəsi.* – [Bəhram Saraya:] *Sən mənim şəmimsən və mən pərvanə kimi daima dövrəndə fırlanmağa hazıram.* C.Cabbarlı. *Binanın dövrəsində qarovul gəzirdi.* M.İbrahimov. *Vətəgənin dövrəsində yoğunlu-nazikli borular basdırılıb, aralarında qamış çəpər çəkilmişdi.* M.Rzaquluzadə.

3. Misdən, gildən və s.-dən qayrılmış böyük yastı qab, yaxud iri boşqab. *Mis dövrə.* – [Tubu:] [Gülnisə] *bir az düyü arıtla, atana bir dövrə südlü yayma bişir.* Ə.Haqverdiyev. *Təzə samovar bütün servizi ilə, boşqablar, dövrələr, podnoslar, lampalar, güzgülər və bir neçə qablar .. cehiz adı ilə atası qızına verəcəkdir.* R.Əfəndiyev.

4. *xüs*. Arasıkəsilməz silsilə təşkil edən elementlərin birləşməsindən ibarət qurğu. *Elektrik dövrəsi. Telefon dövrəsi.*

5. Yarışın, hər bir iştirakçının ancaq bir dəfə çıxış etməsinə imkan verən hissəsi; tur. *Festivalın birinci dövrəsi. İdman yarışının axırıncı dövrəsi.* // Mərhələlərlə keçirilən bir işin gedişində ayrıca mərhələ, pillə, dövr. *Seçkilərin birinci dövrəsi.*

6. Bir-biri ilə bağlı olan hadisələrin, şeylərin və s.-nin məcmusu, bir şeyin ardıcıl silsiləsi, sikl. *İncəsənətə dair mühazirələr dövrəsi.*

◊ **Dövrə dolanmaq** – bax **dövrə vurmaq** 2-ci mənada. *Rüstəm addım-addım qayanın başına dörd dövrə dolandıqdan sonra, bir də geri dönüb yoldaşlarla xısınlaşdı.* S.Rəhimov. **Dövrə vurmaq** – 1) bax **dövrə vurub (qurub) oturmaq**. *Gəlinin rəfiqələri isə çarpayının yanında dövrə vurmuşdular.* M.Hüseyn. *Bir tonqal qalayıb vurdular dövrə.* M.Seyidzadə; 2) dövrə gəzmək, dolanmaq, aylanmaq, dövr etmək. *Nemətullayev fırlanıb evi dörd dövrə vurdu. Axırda Sübhanverdizadənin çarpayısına yaxınlaşıb döşəkdən yapışdı.* S.Rəhimov. *Aşıq gülürdü, oxuyurdu, nəşə ilə oynaya-oynaya dövrə vururdu.* M.Hüseyn. *Bir ağsaçlı qadın idi ortalıqda dövrə vuran.* N.Rəfibəyli; 3) fırlanmaq, dolanmaq. *Maşın bir dəfə dövrə vurub dayandı.* Ə.Vəliyev. **Dövrə vurub (qurub) oturmaq** – dairə şəklində oturmaq, yan-yana oturub dairə təşkil etmək. *Amma hamı dövrə vurub, yerdə oturub, təkcə Teymur əyləşib uca bir taxtın üstündə.* "M.N.lətif.". *Adamlar sıra ilə deyil, dövrə vurub oturmalı idilər.* H.Sarabski. *Gənclər bir azdan sonra, meşənin ağacları qırılmış meydan kimi düzənlik bir yerində yaşıl otlar üstündə dövrə vurub oturdular.* Ə.Sadıq. **Dövrəsini almaq** – dövrəyə almaq, ətrafına cəmləşmək. *Hamı Tərlanın dövrəsini aldı.* M.Hüseyn. *Qızlar yüyürüb cəld Aynanın dövrəsini aldılar*. Ə.Məmmədxanlı. **Dövrəyə almaq** – əhatə etmək, mühasirə etmək, dörd tərəfinə yığışmaq, ətrafına yığışmaq. *Yoldaşlarından bir dəstəsi İkramın çarpayısını dövrəyə alıb durmuşdu.* Ə.Əbülhəsən.

**DÖVRƏLƏMƏ** 1. "Dövrələmək"dən *f.is.*

2. *zərf* Dövrə vuraraq, dairəvi. [Adamlar] *alaçıq boyu dövrələmə oturub, Qaragözün verdiyi buğlanan çayı içməyə başladılar.* M.İbrahimov.

**DÖVRƏLƏMƏK** *f.* Əhatə etmək, dövrəyə almaq, araya almaq, dörd tərəfini tutmaq.

**DÖVRƏLƏNMƏ** "Dövrələnmək"dən *f.is.*

**DÖVRƏLƏNMƏK** 1. *məch*. Dövrəyə alınmaq, əhatə edilmək, araya alınmaq.

2. *t-siz*. Halqalanmaq, halqa kimi görünmək, genəlmək. *Onun duru gözləri dövrələnib genişləndi.* S.Rəhimov.

**DÖVRƏLƏŞDİRMƏ** "Dövrələşdirmək"dən *f.is.*

**DÖVRƏLƏŞDİRMƏK** *f.* Dövrə (dairə) şəklinə salmaq; girdələşdirmək.

**DÖVRƏLƏYİCİ** *sif.* Dövrəyə alan, dörd bir tərəfini tutan, mühasirəyə alan.

**DÖVRƏLİ** *sif.* Çevrəsi geniş, ətrafı geniş. *Bu yer çox dövrəli yerdir.*

**DÖVRƏMƏ** *sif.* Dövrə (dairə) şəklində; dairəvi. *Ətrafına bir dövrəmə cızıq çəkib deyir: – Ayağını bu cızıqdan bayıra qoysan, özün bil!* "M.N.lətif".

**DÖVRƏSİFƏT** *sif.sif*əti girdə; girdəsifət.

**DÖVRƏVİ** *sif.* Dövrə xassəsində, dövrə mahiyyətində, dövrə şəklində olan. *Dövrəvi hərəkət*.

**DÖVRİ** *sif.* [*ər*.] 1. Bax **dövrəvi**. *Dövri hərəkət.*

2. Müəyyən vaxtlarda çıxan. *Dövri mətbuat.*

3. Vaxtdan-vaxta təkrar edən, müəyyən vaxtlarda (dövrlərdə) baş verən; vaxtaşırı. *Xəstəliyin dövri tutmaları.*

**DÖVRİLİK** *is.* Bir şeyin dövri olması, müəyyən vaxtlarda, vaxtaşırı təkrar etməsi, baş verməsi.

**DÖVRİYYƏ** *is.* [*ər*.] 1. *iqt*. Gəlir əldə etmək və təkrar istehsal üçün pulun, malın dövr etməsi, tədavülü. *Pul dövriyyəsi. Mal dövriyyəsi. Müəssisənin illik dövriyyəsi.*

2. *xüs*. Hər hansı bir işin, əməliyyatın, prosesin təkrar edən dövrü; dövretmə. *Tarlada toxum dövriyyəsi. Gəmilərin dövriyyəsini sürətləndirmək.*

**DÖVRLƏŞDİRİLMƏ** "Dövrləşdirilmək"dən *f.is. Ədəbiyyat tarixinin dövrləşdirilməsi.*

**DÖVRLƏŞDİRİLMƏK** *məch*. Dövrlərə bölünmək.

**DÖVRLƏŞDİRMƏ** "Dövrləşdirmək"dən *f.is.*

**DÖVRLƏŞDİRMƏK** *f.* Dövrlərə ayırmaq (bölmək). *Dil tarixini dövrləşdirmək.*

**DÖVRLƏŞMƏ** "Dövrləşmək"dən *f.is.*

**DÖVRLƏŞMƏK** *f.* Ayrı-ayrı dövrlərə bölünmək (ayrılmaq).

**DÖYCƏ** *is. məh*. Peyvənd, qələm.

**DÖYCƏLƏMƏ** "Döycələmək"dən *f.is.*

**DÖYCƏLƏMƏK** *f. məh*. Döycə (peyvənd, qələm) vurmaq.

**DÖYCƏLƏTMƏK** *icb. məh*. Döycə (peyvənd, qələm) vurdurmaq.

**DÖYDÜRMƏ** "Döydürmək"dən *f.is.*

**DÖYDÜRMƏK, DÖYDÜRTMƏK** "Döymək"dən *icb*. [Pristav:] *Doğrusunu de, yoxsa səni yıxdırıb o qədər döydürərik ki, bir ay yorğan-döşəkdə qalarsan*. Ə.Haqverdiyev.

**DÖYƏC** *is*. 1. Keçmişdə: kəlağayı və ya bezi üzüsığallı daş üstündə ağac çəkiclə döyəcləyib şax və sığallı hala salma işi. *Döyəc görməmiş kəlağayı parlamaz. Döyəcdən çıxmış göy bezə qədək deyilir.*

2. Döymək, döyəcləmək üçün alət, yaxud çəkic, gürz. // Ağac, həvəng.

**DÖYƏCÇİ** *is*. Çəkicvuran. *Döyəcçilərin məharətlə vurduğu çəkiclərin səsi pulemyot səsi kimi müntəzəm eşidilirdi*. P.Makulu.

**DÖYƏCDAŞI** *is. xüs*. Üstündə şey döyəcləmək, döyəc işi aparmaq üçün sığallı daş.

**DÖYƏCƏ** b a x **döyməc**.

**DÖYƏCLƏMƏ** "Döyəcləmək"dən *f.is.*

**DÖYƏCLƏMƏK** *f.* 1. Bir şeylə döymək, vurmaq. *Az qalıb, mənzil başına çatmışıq, – deyə arabaçı öküzləri döyəclədi.* T.Ş.Simurq.

2. Bir şeylə üstündən vuraraq (döyərək) düzləndirmək, yastılatmaq, bərkitmək, basıb sıxlaşdırmaq, bərabərləşdirmək. *Damın torpağını döyəcləmək. İsti qırı (asfaltı) döyəcləmək. – Sofiya xanım irəli yeridi, odunları maşa ilə döyəclədi, çırpdı, sonra birbirinə yavıqlaşdırıb sobanın ağzını örtdü.* Çəmənzəminli.

3. *məc.* Ara vermədən çarpmaq, döymək, vurmaq, taqqıldatmaq. *Yağış pəncərəni döyəcləyir. – Bir də görərdin, hərə əlinə bir mis qapıb dama çıxar və onu döyəcləyərdi.* H.Sarabski. *Dəniz ara vermədən buruğun polad sütunlarını döyəcləyirdi.* M.İbrahimov. *Köpüklü dalğalar sahilə doğru şütüyərək, sıldırım qayaları hirslə döyəcləyirdi.* M.Hüseyn.

4. *məh. dan*. Birnəfəsə danışmaq, demək. *Qız məni çıxılmaz bir döngəyə salıb döyəclədi.* M.S.Ordubadi.

**DÖYƏCLƏNMƏ** "Döyəclənmək"dən *f.is.*

**DÖYƏCLƏNMƏK** *məch*. Bir şeylə üstündən döyülmək, vurulmaq.

**DÖYƏNƏK** 1. *is*. Çox sürtülməkdən, toxunmaqdan, bir şeyə dəyməkdən, yaxud döyülməkdən dəridə əmələ gələn sərtlik, qalınlıq; qabar. *Əlləri döyənəkdir. İri ayaqqabı ayaqlarda qabar və döyənək əmələ gəlməsinə səbəb olur. – İllərlə isti küləklərin, qara yellərin, quraq havaların vurduğu sillə, şapalaqların döyənək yeri sağalırdı.* Ə.Vəliyev. □ **Döyənək olmaq** – döyənək əmələ gəlmək. *Gündə yüz yol vurardılar dəyənək; Sağrısı sərbəsər olub döyənək.* S.Ə.Şirvani. *Qoca döyənək olmuş əlini irəli uzatdı.* S.Rəhimov.

2. *sif.* Çox gəzilib tapdalanmış yer; çox döyəcləməkdən, sürtünməkdən, tapdalanmaqdan, yaxud quraqlıqdan bərkimiş yer; tapdaq. *Çox ayaqlanmaqdan bağlar döyənək olmuşdur.*

◊ **Döyənəyini basmaq (tapdalamaq, ayaqlamaq)** – birini ən çox narahat edən, ən çox ağrıdan, incidən, ən çox toxunan şey haqqında. *Bayram sanki bəyin ən nazik yerindəki döyənəyi ayaqlayıbmış.* Ə.Vəliyev.

**DÖYƏNƏKLİ** *sif.* Döyənəyi olan, qabarlı. *Döyənəkli ayaqlar.*

**DÖYƏNƏKOTU** *is. bot*. Meşələrdə, rütubətli yerlərdə bitən çoxillik ot bitkisi.

**DÖYMƏ** *is.* 1. "Döymək"dən *f.is.*

2. Quru meyvə tozu (poroşoku).

3. *xüs*. Döymə üsulu ilə mis, dəmir və s. üzərində salınmış naxış, şəkil.

4. Buğda yarmasından bişirilən xörək. *Döymə qışda yeyilən xörəkdir. – Qışda döymə, yayda döyməc.* (Məsəl).

5. Döyülmüş və ya toxmaqla əzilmiş ət.

6. *məh*. Doğranmış qabıq, ya yarpaq (mal-qara yemi).

7. Nərd oyunlarından birinin adı.

8. Dəridə iynə ilə yazılmış yazı və ya çəkilmiş şəkil; tatuirovka.

**DÖYMƏC** *is. məh*. Yaş meyvənin döyülməsi ilə hazırlanan yemək. *Gün uzun, külfət oruc, döyməc ilə keçmir əməl.* M.Möcüz. // Doğranmış çörək və pendiri qarışdırıb yağda qovurmaqla hazırlanan yemək. // Ovulmuş çörəklə döyülmüş qoz ləpəsindən hazırlanan yemək.

**DÖYMƏDÖŞƏMƏ** *is. aşp*. İçərisinə döyülmüş ət qoyulmuş, yaxud qarası ət qiyməsi olan plov. [Ağa Kərim xan:] *..Tez ürəktutan xörəklərdən birisi döymədöşəmədir.* N.Vəzirov.

**DÖYMƏK** *f.* 1. Əziyyət vermək, yaxud cəzalandırmaq üçün birini əl, yaxud başqa bir şeylə vurmaq; kötəkləmək, əzişdirmək. *Xanım haqsız yerə* [Sarıköynəyi] *söyübdanlamağa, döyməyə, incitməyə başlayır.* S.Hüseyn. [Qədir:] *Öküzü döyməyə ürəyim gəlmir, bu vay-haray insanların qəlbini parçalamırdı?* Mir Cəlal. *Bəyin Camalı döydüyünü görən kəndlilər tökülüb gəldilər..* Ə.Abasov.

2. Çəkicin zərbi ilə müəyyən şəklə salmaq. *Dəmiri döymək. – Dəmirçixanada dəmiri zindan üstə qoyub, ağır çəkic ilə döyəndə dəmir başlayır qızmağa.* C.Məmmədquluzadə. // Döyüb yayma üsulu ilə misdən, dəmirdən və s.-dən bir şey hazırlamaq, qayırmaq. *Qazan döymək. Tava döymək. Nal döymək.*

3. Bir şeyi bir şeylə vuraraq səs çıxarmaq, taqqıldatmaq. *Darvazanı döymək. – Mirbağır ağa qulaq asmayıb qapını dəxi də bərk döyür.* C.Məmmədquluzadə. [Şərifzadə:] *..Qapını döyən Zeynaldan başqası olmayacaqdır.* S.Hüseyn. *Xıdırlı kəndində bir qayda var, gecə əvvəlcə kimin qapısını döysən, gərək orada gecələyəsən.* S.Rəhman.

4. *məh.* Vurmaq, döyəcləmək, çarpmaq. *Dalğalar sahil qayalarını döyür. – Küləklər döydükcə al yanağını; Nədir gözlədiyin? – soruşuram mən.* S.Vurğun. *Ocaq sönür, yel əsir, yağış döyür səngəri; Yenə düşür yadıma ömrün ötən günləri.* Ə.Cəmil. // Bir müddət bir şeyi başqa bir şeyə üsulluca vurmaq, toxundurmaq. *Həsən kişi çubuğu külqabına döyməyə başladı.* M.İbrahimov. *Sədr yenə də göy qələmlə masanı döyüb dedi: – Ay Səlim! Bir macal ver, xalq da danışsın.* Ə.Vəliyev.

5. Müxtəlif alətlərlə biçilmiş taxılı, dəni sünbüldən ayırmaq. *Qocaqurd mahalında buğdanı biçən kimi döyməzlər.* Ə.Haqverdiyev. [Rəşid:] *Qurbanqulu da quyunun yaxınlığında taxıl döyürdü.* T.Ş.Simurq. *Biçin vaxtı yetişdi.* [Nadir] *taxılını hamıdan qabaq biçdi, döydü, təmizlədi.* B.Talıblı.

6. Üyütmək, narın hala salmaq. *Badam, qoz ləpəsini həvəngdə döymək. İstiot döymək.*

7. Qiymə etmək, qiymə halına salmaq (qiyməkeş və s. ilə). *Ət döymək.*

8. *məc.* Məğlub etmək, əzişdirmək, əzmək. *Düşməni yaxşıca döydük.*

9. Müəyyən üsulla bədənə bir maddə yeritmək. ◻ **Çiçək döymək** – orqanizmə çiçək xəstəliyinə qarşı maddə daxil etmək. *..Əgər uşağa vaxt ikən çiçək mayasını döysən, dəxi bu uşağı çiçək naxoşluğu tutmaz...* C.Məmmədquluzadə.

10. *məh. dan*. Etmək. *Mərdan qiymət davası döymürdü. Ancaq pulu bərk yerdə idi.* Mir Cəlal.

11. Arası kəsilmədən vurmaq, bombalamaq; topa tutmaq, gülləyə basmaq. *Toplarımız düşmən səngərlərini döyürdü. – Eynüddövlənin topları xiyabanın hər tərəfini döyməyə başlamışdı.* M.S.Ordubadi. *Düşmən təyyarələri körpünü döyməsə də, tez-tez arxaya ötürdü.* Mir Cəlal.

12. Bir sıra isimlərə qoşularaq müxtəlif ifadələr düzəldilir; məs.: ayaq döymək, döşünə döymək, gözlərini döymək, mürgü döymək.

**döyə-döyə** *zərf* Bir şeylə vura-vura, fiziki qüvvə işlədərək. *Usta ağlaya-ağlaya fikrə getdi və birdən qalxıb başına döyə-döyə hönkürdü.* Çəmənzəminli. // *məc*. Zorla, zor gücü ilə, zor işlədərək. [Kərbəlayı Fərəc:] *Sözün qurtaranı, məndən döyə-döyə dörd manat alıb yola saldılar.* C.Məmmədquluzadə.

**DÖYMƏKABAB** *is.* Döyülmüş ətdən bişirilən kabab. *Başladı zakazı: döymə kabab, cücə kababı, çoxoxbili, daha nə bilim nə.* Ə.Haqverdiyev.

**DÖYMƏQİYMƏ** *is. aşp*. Döyülmüş ət, noxud və kişmişdən bişirilən yemək.

**DÖY-SINDIR** *zərf dan.* Bərk-bərk döyərək, əzişdirərək; döyülmüş halda. *Kişini döysındır aparıb qatırlar zindana.* "M.N.lətif.".

**DÖYÜKDÜRMƏ** "Döyükdürmək"dən *f.is.*

**DÖYÜKDÜRMƏK** *f.* Təəccübləndirmək, mat qoymaq, çaşdırmaq. *Bünyadın qulaqları uğuldayırdı*, [külək] *onu döyükdürmüşdü.* Ə.Əbülhəsən.

**DÖYÜKMƏ** "Döyükmək"dən *f.is.*

**DÖYÜKMƏK** *f.* Özünü itirmək, mat qalmaq, təəccüb etmək, çaşıb qalmaq, çaşmaq. *Sofiya xanım Rüstəm bəyi görən kimi əvvəl döyükdü, rəngi qaçdı.* Çəmənzəminli. [Ruqiyyə] *ovçu əlindən qurtarmış maral kimi döyüküb töysünürdü.* A.Divanbəyoğlu. *Arvad qab dəsmalı ilə yaşarmış gözlərini silib ərinin qabağında döyükə-döyükə* (z.) *qaldı.* S.Rəhman.

**DÖYÜKMÜŞ** *f.sif.* Çaşmış, özünü itirmiş, çaşıb qalmış, mat qalmış. *O, içəri girdi, döyükmüş gözləri ilə dükanın içindəkilərə baxdı.* M.Hüseyn. *..Qulam döyükmüş* (z.) *halda ətrafına baxınıb soruşdu.* Ə.Əbülhəsən. *Camaat hamısı döyükmüş* (z.) *halda bir-birinə baxırdı.* Ə.Vəliyev.

**DÖYÜLMƏ** "Döyülmək"dən *f.is.*

**DÖYÜLMƏK** *məch.* 1. Əl və ya başqa bir şeylə vuraraq əziyyət verilmək; kötəklənmək, əzişdirilmək. *Bərk döyülmək. – Bir də görürdün* [Dəli Səməd] *döyüldüyü yerdə, gözləri yaşlı qəhqəhə çəkib gülürdü.* Çəmənzəminli. [Əhməd:] *Təqsir onda, amma döyülən mən.* Ə.Haqverdiyev. [Səfər:] *Döyülməyinə döyüləcəyəm, qoy .. ağıllı-başlı döyülüm.* C.Cabbarlı.

2. Çəkicin zərbi ilə yayılıb müəyyən şəklə salınmaq. *Mis döyülüb nazikləşdirildi.*

3. Bir şeylə vurularaq səs çıxarılmaq; taqqıldadılmaq. *Qapı döyülür, Asya qapını açır.* Ü.Hacıbəyov. *Birdən qapının yavaşcadan döyüldüyü eşidildi.* S.Hüseyn. *Çox keçmədi ki, pəncərə içəridən iki dəfə yavaşca döyüldü.* Ə.Abasov.

4. Sünbüldən ayrılmaq (müxtəlif alətlər vasitəsilə). *Hətta burası da yadımdadır ki,* ..[taxıl] *təzə döyülürdü.* C.Məmmədquluzadə. *..Gecə döyülən taxılı sovururdular.* Ə.Əbülhəsən. *Tarlalardan biçilmiş buğda, arpa* [sentyabrda] *xırmanlarda döyülüb yığışdırılır.* Ə.Sadıq.

5. Üyüdülmək, narın hala salınmaq. *Həvəngdə döyülmək.*

6. Qiymə halına salınmaq. *Ət qiyməkeşlə döyüldü.*

7. *məc.* Məğlub edilmək, əzişdirilmək.

8. *xüs.* Müəyyən üsulla bədənə yeridilmək.

**DÖYÜLMÜŞ** *f.sif.* 1. Əziyyət verilmək üçün əl və ya başqa bir şeylə vurulmuş; kötəklənmiş, əzişdirilmiş. // Məğlub edilmiş.

2. Sünbülündən ayrılmış. *Döyülmüş taxıl.*

3. Üyüdülmüş, narın hala salınmış. *Həvəngdə döyülmüş qoz* (*badam*) *ləpəsi.*

4. Qiymə halına salınmış. *Döyülmüş ət.*

**DÖYÜM** *is.* Taxıl döymə işi. *Taxıl döyümü. Döyüm başlandı. – Kəndlərin çoxunda biçin başlayıb sürətlə davam edirdi. Döyüm üçün kəndlilər .. çox tələsirdilər.* Ə.Əbülhəsən.

**DÖYÜN** b a x **döyüm**. *Kəndlilər biçindən, döyündən və bağ-bostandan qayıtmışdılar.* Ə.Abasov. // Döyülən taxıl. *Sovuruq atan kişilər əllərindəki ağac şanalar ilə toplanan döyünü düzəldir və sahmana salırdılar.* S.Rəhimov.

**DÖYÜNÇÜ** *is.* Taxıldöyən adam; xırmançı. *Başıçalmalı döyünçü qoca xırmançı Pasını qarşıladı.* S.Rəhimov.

**DÖYÜNÇÜLÜK** *is.* Döyünçünün işi, peşəsi.

**DÖYÜNDÜRMƏ** "Döyündürmək"dən *f.is.*

**DÖYÜNDÜRMƏK** *icb.* Döyünməyə məcbur etmək, döyünməsinə səbəb olmaq. *Ürəyini döyündürmək.*

**DÖYÜNMƏ** "Döyünmək"dən *f.is. Ürək döyünməsi.*

**DÖYÜNMƏK** 1. *f.* Xəstəlik üzündən, yaxud qorxudan, həyəcandan, fərəhdən və başqa səbəblərdən tez-tez vurmaq, çırpınmaq (ürək). *..On beş yaşına gəlincə hər kəs* [tənbəkini] *çəksə, onun boyu çıxmaz, özünün də ürəyi döyünər.* H.Zərdabi. *Məsum uşağın bu halətindən; Madər sevinər bəşarətindən; Qəlbi döyünər məhəbbətindən.* A.Səhhət. *Rəng aldı bu nəğməm görünən qövsi-qüzehdən; Qəlbim döyünüb, lalə kimi güldü fərəhdən!* S.Rüstəm.

2. *qayıd.* Öz-özünü döymək.

**DÖYÜNTÜ** *is.* Döyünmə. *Döyüntü bilməyir burda ürəklər; Səyirdir atını qopan küləklər.* S.Vurğun.

**DÖYÜŞ** *is.* Vuruşma, çarpışma, vuruş, dava. *Döyüş meydanı. Döyüş əməliyyatı. Əsgərlərin döyüş hazırlığı. Döyüşlərdən çıxmış ordu. Döyüş təcrübəsi. – Pozmaz cərgəmizi nə dərə, nə düz; Hazırdır döyüşə qızıl süngümüz.* S.Vurğun. // Mübahisə, mübarizə, deyişmə. *Yaşayırsan əbədi, ölməyib, ölməz şerin; O, döyüşlərdə dəmirdən yenə paltar geyəcək.* S.Rüstəm.

**DÖYÜŞÇÜ** *is.* Sıravi əsgər. *Komandir və döyüşçülər. – Meşədə minlərlə döyüşçünün yerləşdiyinə baxmayaraq, bir səs belə eşidilmirdi.* M.S.Ordubadi. *Başqa bir döyüşçü həyəcanla serjanta tərəf gəlir.* Ə.Məmmədxanlı. □ **Arxa döyüşçüləri** *məc.* – müharibə vaxtı cəbhə arxasında çalışanlar haqqında.

**DÖYÜŞDÜRMƏ** "Döyüşdürmək"dən *f.is.*

**DÖYÜŞDÜRMƏK** *icb.* Bir-biri ilə vuruşdurmaq, dalaşdırmaq, toqquşdurmaq. *Qoç döyüşdürmək. – On üç yaşına çatana kimi mən küçələrdə xoruz döyüşdürürdüm.* C.Məmmədquluzadə. // Bərk-boşluğunu yoxlamaq üçün yumurtaların uclarını bir-birinə vurmaq. *Məlumdur ki, uşaqlar yumurta döyüşdürəndə əvvəl bir dadışırlar.* C.Məmmədquluzadə.

◊ **Söz döyüşdürmək** – b a x **söz**.

**DÖYÜŞDÜRÜLMƏ** "Döyüşdürülmək"-dən *f.is.*

**DÖYÜŞDÜRÜLMƏK** *məch.* Bir-biri ilə vuruşdurulmaq, dalaşdırılmaq, toqquşdurulmaq.

**DÖYÜŞƏN** *f.sif.* Vuruşan, vuruşqan, döyüşkən. *Döyüşən xoruz, qoç.* // Mübarizə edən. *M.S.Ordubadinin "Döyüşən şəhər" adlı romanı tarixi hadisələrə həsr olunmuşdur.*

**DÖYÜŞKƏN** *sif.* 1. Davakar, vuruşqan, savaşqan. *Döyüşkən adam. Döyüşkən xoruz.* – [Səttar:] *Özü arıq bir oğlandır. Amma bilirsən necə döyüşkəndir?* P.Makulu.

2. *məc.* Mübariz, qorxmaz, cəsarətli. [Dilbər:] *Sizi isə, Gülüş, indi mən çox gözəl anlayıram. Mən də qorxaq deyiləm, yaman da döyüşkənəm.* C.Cabbarlı.

**DÖYÜŞKƏNLƏR** *is. zool.* Şirin sularda və akvariumlarda yaşayan kiçik balıq.

**DÖYÜŞKƏNLİK** *is.* 1. Davakarlıq, vuruşqanlıq, savaşqanlıq.

2. *məc.* Mübarizlik, cəsarətlilik.

**DÖYÜŞQABAĞI** *sif.* Döyüş başlamadan əvvəl. *Döyüşqabağı hazırlıq.*

**DÖYÜŞMƏ** "Döyüşmək"dən *f.is.*

**DÖYÜŞMƏK** *f.* (Bir-biri ilə) çarpışmaq, vuruşmaq, savaşmaq, toqquşmaq. *Qoçlar döyüşür. Xoruzlar döyüşlər. – Mərd döyüşəndə namərd qaçar.* (Məsəl). *Dünyanı sellərində çalxayan bizim həyat; Sağdan sola döyüşmüş, sonra yoluna düşmüş.* M.Müşfiq. *Döyüşdükcə qoca qartal; Qüvvət alır balü pəri.* S.Vurğun.

**döyüşə-döyüşə** *zərf* Vuruşa-vuruşa, döyüşərək, vuruşaraq. *Döyüşə-döyüşə irəliləmək.*

**DÖYÜŞ-SÖYÜŞ** *is.* Dava-dalaş, döyüşüb-söyüşmə, dalaşma.

**DÖYÜŞSÜZ** *zərf* Döyüş olmadan, vuruşmadan, çarpışmadan; dinc yolla. Şəhəri döyüşsüz almaq. // Mübarizəsiz. *Qışsız bahar olmadığı kimi, döyüşsüz, əziyyətsiz, qurbansız da qələbə, xoşbəxt həyat yoxdur.* Ə.Abasov.

**DÖZMƏ** "Dözmək"dən *f.is.*

**DÖZMƏK** *f.* 1. Davam gətirmək, tab gətirmək, səbirlə keçirmək, qatlaşmaq. *Ağrıya dözmək. Əziyyətə dözmək. – Soyuq dəmir çəkicə dözər.* (Ata. sözü). // Səbir etmək, təhəmmül etmək, səbirlə gözləmək. *Dözürsən döz bu ayrılıq dağına; Mən dayannam, amma sən dayanmazsan!* M.P.Vaqif. *Dözə bilməm tənhalığın qəhrinə.* Q.Zakir. *Hər möhnətə dözərəm; Sına məni, sına, yar! Əhdimizə inan, yar!* R.Rza.

2. Razılaşmaq, barışmaq, keçirmək, yol vermək. *Belə şeylərə dözmək olmaz. – Yox, sən buna dözməzsən, elin vuran qolusan; Sən namus aşiqisən, şərəflisən, ulusan.* M.Rahim.

**DÖZÜLMƏ** "Dözülmək"dən *f.is.*

**DÖZÜLMƏK** *məch.* Davam gətirilmək, tab gətirilmək; təhəmmül edilə bilmək, keçirilə bilmək.

**DÖZÜLMƏZ** *sif.* Dözmək mümkün olmayan, dözülə bilməyən, dözülməsi çətin olan. *Dözülməz vəziyyət. Dözülməz isti. Dözülməz hərəkət. Dözülməz söz. – Çoxları məyus oturmuşdu. Bu hal özü də geridə qalmağın nə dərəcədə ağır və dözülməz bir şey*

*olduğunu anlamağa kafi idi*. M.Hüseyn. *Bu ləngimələr Nəriman üçün dözülməz idi.* Mir Cəlal. *Gecə olmasına baxmayaraq, barjın anbarında dözülməz bir bürkü var idi.* M.Rzaquluzadə.

**DÖZÜLMƏZLİK** *is.* Dözülə bilməməzlik, dözülməz vəziyyət. [Firidun:] *Həyatımızın dözülməzliyinə dair sizin əqli və məntiqi dəlilləriniz əleyhinə bir şey demək mümkün deyildir..* M.İbrahimov.

**DÖZÜM** *is.* Dözmə, qatlaşma qabiliyyəti; mətanət, dəyanət, səbir etmə, dayanma, davam gətirmə, tab gətirmə; davam, səbat. *Dözümü yoxdur. – Dağlar, səndə gözüm var: Dərdə məndə dözüm var.* (Bayatı). [Buğac] öz *gücünü, çevikliyini, bədəninin dözümünü sınayırdı.* M.Rzaquluzadə.

**DÖZÜMLÜ** *sif.* Dözümü olan; səbirli, davamlı, tablı, mətanətli. *Qaraca qız da Nurəddin kimi pis günə dözümlü, səbirli bir uşaqdır.* S.S.Axundov. *İdris, sən yaxşı bilirsən ki, müharibə dəhşətli bir müharibədir. Onun çovğunları və boranları hələ qabaqdadır. Gələcəkdə də dözümlü ol!* S.Vurğun. *Neylim, mən beləyəm, sən də eləsən; Mənim çox dözümlü məhəbbətim var.* S.Rüstəm.

**DÖZÜMLÜLÜK** *is.* Dözmə, tab gətirmə, davam gətirmə qabiliyyəti; cismən və mənən möhkəmlik, davamlılıq, səbirlilik, səbat, mətanət. *Futbol insanda dözümlülük, çəldlik, çeviklik kimi keyfiyyətlər tərbiyə edir*.

**DÖZÜMSÜZ** *sif.* Dözümü olmayan; səbirsiz, davamsız, tab gətirə bilməyən, tabsız. *Püstəxanım həddindən artıq dözümsüz idi.* M.Hüseyn.

**DÖZÜMSÜZLÜK** *is.* Dözümün olmadığı hal və keyfiyyət; cismən və mənən davamsızlıq, səbatsızlıq, mətanətsizlik.

**DÖZÜŞ** b a x **dözüm**.

**DRÁXMA** *is.* [*yun.*] Yunanıstanın pul vahidi.

**DRAJE** *is.* [*fr.*] 1. Yumru formalı kiçik konfet.

2. *tib*. Yumru dərman dənələri.

**DRAQÚN** [*fr.*] Çar ordusunda və bəzi xarici ölkə ordularında: xüsusi atlı qoşun hissələri nəfəri, yaxud zabiti. *Draqun polku. – Axşam yeməyinin axırına qədər Qruşnitski draqun kapitanı ilə pıçıldaşır və gözləşirdi.* Lermontovdan.

**DRAM** 1. B a x **drama**. *Hələ 1932-ci ildən düşünməkdə olduğu "Əfqanıstan" dramı üzərində Cabbarlı daha ciddi çalışmaq niyyətində idi.* M.Arif.

2. Sif. mənasında. *Dram janrı. Dövlət dram teatrı. Dram əsərləri.*

**DRÁMA** [*yun.*] 1. Səhnədə ifa olunmaq üçün dialoq şəklində (müəllifin öz sözü olmadan) yazılmış ədəbi əsər növü. *N.Vəzirovun dramaları. Yeni dramanın tamaşaya qoyulması. – İstər şeirlərində və istərsə də ilk hekayə və dramalarında Cabbarlı hər gün təsadüf edib gördüyü, eşitdiyi və həyəcanlandığı şeylərdən yazırdı.* M.Arif.

2. Dram teatrı. *Bu axşam dramada nə gedir? Dramaya bilet almaq.*

3. *məc.* Faciə, ruhi iztirab. *Drama keçirmək. Ailə draması.*

**DRAMATÍK** *sif.* [*yun.*] 1. Dramaya məxsus, dramaya aid olan. *Dramatik artist. Dramatik sənətkar.*

2. Dramatizm ilə dolu; ağır, gərgin, sarsıdıcı; faciəli. *Dramatik səhnə. Dramatik hadisə.*

3. *mus*. Tembrcə güclü, bir qədər kəskin (səs haqqında). *Dramatik tenor. Dramatik soprano.*

**DRAMATİKLƏŞDİRİLMƏ** "Dramatikləşdirilmək"dən *f.is.*

**DRAMATİKLƏŞDİRİLMƏK** *məch.* Dramatizmi, gərginliyi şiddətləndirilmək; dramatik şəklə salınmaq.

**DRAMATİKLƏŞDİRİLMİŞ** *f.sif.* Dramatizmi, gərginliyi şiddətləndirilmiş; dramatik şəklə salınmış.

**DRAMATİKLƏŞDİRMƏ** "Dramatikləşdirmək"dən *f.is.*

**DRAMATİKLƏŞDİRMƏK** *f.* Dramatizmi, gərginliyi artırmaq, şiddətləndirmək; dramatik şəklə salmaq.

**DRAMATİKLİK** b a x **dramatizm**.

**DRAMATÍZM** [*yun.*] Hadisələrin dramaya xas olan gərginliyi; dramatiklik. *Süjetin dramatizmi. Pyes dramatizmlə doludur.* // Faciəlilik.

**DRAMATURGÍYA** [*yun.*] *ədəb*. 1. Drama sənəti. *Dramaturgiya əsərləri. Dramaturgiyanın vəzifələri.*

2. Hər hansı bir xalqın, yazıçının, dövrün və s.-nin dramatik əsərləri. *M.F.Axundzadə dramaturgiyası. Maarifçi dramaturgiyanın inkişafında yeni mərhələ hamıdan əvvəl N.Vəzirovun yaradıcılığı ilə başlayır.*

3. Dramatik əsərlər yazma nəzəriyyəsi. *Dramaturgiyanın əsasları.*

**DRAMATURJİ** *sif.* [*yun.*] Dramaturgiyaya aid. *Dramaturji fəaliyyət. Dramaturji məharət. Əsərin dramaturji quruluşu. –* [“Solğun çiçəklər”dəki] *dramaturji vəziyyət .. mürəkkəbdir; çünki burada nadanlıqdan və cəhalətdən artıq tamah, pul, xüsusi mülkiyyət böyük rol oynayır.* M.Arif.

**DRAMATURQ** [*yun.*] *ədəb*. Drama yazan yazıçı. *“Solğun çiçəklər” pyesində Cabbarlının bir dramaturq kimi müvəffəqiyyəti pulun pozucu təsirini göstərməyə təşəbbüs etməsi idi.* M.Arif. [H.Ərəblinski] *heç bir tamaşa buraxmır, artistlərlə, dramaturqlarla maraqlanırdı.* S.Rəhman.

**DRAMATURQLUQ** *is.* Dramaturqun işi, peşəsi, sənəti, məşğuliyyəti; drama yazma sənəti.

**DRAMLAŞDIRILMA** “Dramlaşdırılmaq”-dan *f.is.*

**DRAMLAŞDIRILMAQ** *məch*. Dram şəklinə salınmaq.

**DRAMLAŞDIRILMIŞ** *f.sif.* Dram şəklinə salınmış. *Dramlaşdırılmış roman.*

**DRAMLAŞDIRMA** “Dramlaşdırmaq”dan *f.is.*

**DRAMLAŞDIRMAQ** *f.* Dram şəklinə salmaq. *Hekayəni dramlaşdırmaq.*

**DRAMNƏVİS** *is.* [*yun*. dram və *fars*. ...nəvis] *köhn*. b a x **dramaturq**. *Dramnəvis özü də bugünkü tamaşadan çox razı qalmışdı.* S.Rəhimov.

**DRAMNƏVİSLİK** *köhn*. b a x **dramaturqluq**.

**DRAP** [*fr.*] Üst paltarı üçün qalın yun parça növü. *Mağazadan üç metr drap aldım.* // Bu parçadan tikilmiş. *Qoşatxan sarı drap paltosunun ətəyini yığıb maşından çıxan özü kimi balacaboy arvadını qarşılayıb qolundan tutdu.* M.İbrahimov.

**DREDNÓUT** [*ing.*] Müasir xətt gəmisinin sələfi olan güclü silahlarla silahlanmış, itigedən iri zirehli gəmi.

**DREL** *is.* [*rus.*] Burğu aləti, cihaz.

**DRENÁJ** [*fr.*] 1. *tex*. Arxlar və ya borular sistemi vasitəsilə torpağın qurudulması; həmçinin bu məqsəd üçün işlədilən arx və borular sistemi. *Drenaj arx. Drenaj kanal. Drenaj sistemi. – Şoran torpaqları yuduqda şor suyu axıtmaqdan ötrü dərin və bəzən də dayaz drenaj kanallar qazılır.*

2. *tib*. Piltə çəkmə, piltə vasitəsilə yaradan irinin çəkilməsi və bu məqsəd üçün tətbiq edilən rezin, ya şüşə boru. *Drenaj salmaq. Drenaj qoymaq.*

**DRENAJLAMA** *tex. tib*. “Drenajlamaq”-dan *f.is.*

**DRENAJLAMAQ** *f.* 1. *tex*. Torpağı arxlar və ya borular sistemi vasitəsilə qurutmaq.

2. *tib*. Piltə çəkmək; irini çəkmək üçün yaraya piltə qoymaq.

**DRENAJLANMA** “Drenajlanmaq”dan *f.is.*

**DRENAJLANMAQ** *məch*. 1. *tex*. Arxlar, ya borular vasitəsilə qurudulmaq. *Bataqlıq drenajlandı.*

2. *tib*. Piltə qoyulmaq; piltə və s. vasitəsilə çəkilmək (irin).

**DREYF** [*holl.*] *dəniz*. Buzların, gəmilərin və s.-nin öz-özünə külək və ya cərəyan istiqamətində hərəkət etməsi.

**DREZÍNA** [*alm.*] Rels üzərində motor və ya əllə hərəkətə gətirilən kiçik dəmiryol arabası, vaqonu.

**DRUJÍNA** [*rus.*] 1. *tar*. Qədim Rusiyada: knyazların yaxın xidmətçiləri və qoşunu.

2. *köhn*. İctimai asayiş və qaydanı, nizam-intizamı qorumaq üçün milis orqanlarına kömək məqsədi ilə ictimaiyyət tərəfindən yaradılan könüllülər dəstəsi.

**DRUJİNAÇI** *is.* Drujina üzvü, drujina nəfəri.

**DUA** *is.* [*ər.*] 1. Adamların bir mətləblə Allaha və müqəddəs saydıqları şəxslərə müraciət, yaxud da ibadət zamanı zikr etdikləri sözlər. *Şəhərin kənarı, camaat ayaq üstə, əlləri duada, dodaqları dua vird edir.* C.Məmmədquluzadə. // Bu məzmunda olan mətn, yazı. *Dua kitabı. – Nə qədər dua yazdırırlar, pirə aparırlar və bu kimi avamca müalicə edirlərsə də, fayda vermir.* S.S.Axundov. *Nəhayət, uşaq üçün fala baxdırıb tas qurdurar və dua yazdırardılar.*

H.Sarabski. *Şair gedir... Bu gün dua əvəzinə həzin-həzin, Oxuyurlar "Şəbi-hicran" qəzəlini Füzulinin.* B.Vahabzadə. // Allaha yalvarış; bir xahişlə, iltimasla, yaxud təşəkkürlə Allaha, müqəddəs sayılanlara müraciət; dua mərasimi. ◻ **Dua etmək (eləmək)** – 1) Allaha müraciət edib yalvarmaq, iltimas etmək. [Hacı:] *Otur evdə, dua eylə ki, gəlsin qardaşın Səlim.* C.Cabbarlı. [Ömər koxa] ..Yatmazdan əvvəl üzünü qibləyə çevirib dua elədi. İ.Şıxlı; 2) birisinə təşəkkür, minnətdarlıq ifadəsi olaraq Allaha müraciətlə onun üçün xoşbəxtlik, rifah və salamatlıq diləmək. *Muzdur şadlığına sağ əlini yuxarı qalxızıb Sədrəddin bəyə və prokurora dua etdi.* S.M.Qənizadə. *Ramazan yenə də Tahiri düşünür, ürəyində ona dua eləyirdi.* M.Hüseyn.

2. Salam mənasında. [Hacı Qənbər:] *Get, axşama düşərsən və mənim tərəfimdən çox-çox dua apar.* N.Vəzirov.

**DUAÇI** *is. köhn.* Dua edən, birinə yaxşılıq, uzun ömür, səadət arzu edən adam. *Borclunun duaçısı alacaqlıdır.* (Ata. sözü). *Duaçınam, salma məni nəzərdən; Əskik olmayasan sənadan, Pəri!* M.P.Vaqif. [Xudayar bəy:] *Bəlı, qazı ağa, əgər işi bir təhərnən yoluna qoysanız, biz sizə, duaçı olarıq.* C.Məmmədquluzadə.

**DUAGU** [*ər.* dua və *fars.* ...gu] *köhn.* bax **duaçı**. *..Əgər bizim vilayətin əhvalını xəbər almaq istəsəniz, lillahülhəmd, sağ və salamat sizin ömrünüzə duagu varıq.* C.Məmmədquluzadə. [Məşədi Püstə bacı:] *A bala, boyuna qurban! Hər yerdə olsan, duagunam, sənin kimi oğlanı heç mən yaddan çıxararam?* H.Sarabski.

**DUALAMA** "Dualamaq"dan *f.is.*; dua oxuma mərasimi.

**DUALAMAQ** *f. din.* Nikah mərasimində oğlanla qızın bir yerdə xoşbəxt və uzun ömür sürmələri üçün dua oxumaq; dualama mərasimi icra etmək. *Gəlini molla dualayandan sonra faytona minişərdilər.* R.Əfəndiyev.

**DUALANMA** "Dualanmaq"dan *f.is.*

**DUALANMAQ** *məch. din.* Üzərində dualama mərasimi icra edilmək.

**DUALATMA** "Dualatmaq"dan *f.is.*

**DUALATMAQ** *icb. din.* Dualama mərasimi icra etdirmək (başqası vasitəsilə).

**DUALİ́ST** [*lat.*] Dualizm (1-ci mənada) tərəfdarı. // Sif. mənasında. *Dualist dünyagörüşü.*

**DUALİ́ZM** [*lat.*] 1. *fəls.* Varlığın əsasını, bir-birini inkar edən və bir-biri ilə mübarizə aparan iki əsas səbəb (materializm və idealizm) təşkil etdiyini iddia edən fəlsəfi nəzəriyyə (*monizm* ziddi).

2. Ümumiyyətlə, ikilik.

**DUA-SƏNA** *is.* [*ər.*] bax **dua** 1-ci mənada. ◻ **Dua-səna etmək** – bax **dua etmək** ("**dua**"da). *Şəms padşaha dua-səna edib xəzinənin üstünə gəldi, açarları alıb işə başladı.* (Nağıl). *Anası uşağı Cavadın qucağından aldıqdan sonra dua-səna etməyə başladı.* Ə.Vəliyev.

**DUAYAZAN** *is. din. köhn.* Dua yazmaqla məşğul olan adam. [Sərvinaz xanım:] *..Deyiblər İrandan bir duayazan gəlib, getmişəm onun da yanına, beşcə manat ona vermişəm, genə bir əsər olmayıb.* N.Vəzirov.

**DUBLÉT** [*fr.*] *kit.* Hər hansı bir şeyin ikinci nüsxəsi; iki eyni şeydən biri. *Kitabın dubleti. Heykəlin, qravürün dubleti.* // Qoşa.

**DUBLİKÁT** [*lat.*] Əsil sənədi əvəz edən ikinci nüsxəsi, surəti. *Talonun dublikatı.* // Sif. mənasında. *Dublikat nüsxə.*

**DUBLYÁJ** [*fr.*] Səsli kinofilminin danışıq hissəsinin yeni, başqa dildə danışıqla əvəz edilməsi, başqa dilə çevrilməsi.

**DUBLYONKA** *is.* [*rus.*] Aşılanmış dəridən astarı tük (yun) kürk və gödəkcə.

**DUBLYÓR** [*fr.*] 1. Başqası ilə yanaşı olaraq eyni işi, yaxud bənzər işi görən adam və s.

2. Əsas rolu, yaxud oyunçunu əvəz edən aktyor, ya oyunçu. // Başqa dilə çevrilmiş filmin mətnini söyləyən kinoaktyoru.

**DUBLYORLUQ** *is.* Dublyorun işi (bax **dublyor**). *Dublyorluq etmək.*

**DUD** *is.* [*fars.*] Əsil mənası "tüstü" olub, klassik şeirdə və folklorda çox vaxt "dudi-ah", "dudi-dil" və s. tərkiblərində "ah, fəğan" mənasında işlənmişdir. *Dudi-ahindir, Xətayi, gögdə buludlar sənin; Durmayıb tök göz yaşın, kim əbri-baran devridir.* Xətayi. *Başdan-ayağa nədir bu yanmaq; Dudi-dilə dəmbədəm boyanmaq?* Füzuli. *Çəkdi dudi-ahimi ta çərxi çənbərbar tüfəng.* M.P.Vaqif.

*Zərrəcə gəlməzsən nəzarıma sən; Dudi-ahın mən dəhanə yetirrəm.* Aşıq Pəri.

**DUDA** *is.* [*fars.*] Neft, mazut, qaz və s. yanmasından hasil olan his. *Quru qazlardan əsas etibarilə yanacaq kimi, duda istehsalında isə xammal kimi istifadə olunur.*

**DUDALI** *sif.* Hisli, hislə örtülmüş, his basmış. *Dudalı boru.*

**DUDƏ** b a x **duda**. *Sübhi-əzəldən üzün etdikdə təcəlli; Məhv oldu cahanı bürüyən dudeyi-zülmat.* M.Ə.Sabir.

**DUDKEŞ** *is.* [*fars.*] Tüstüçəkən boru. *Qəzənfər çıxıb qaynayan samovarın dudkeşini götürdükdə Şirzadı gördü.* M.İbrahimov. *Samovarın dudkeşindən gur alov qalxanda Nazxanım bizə yanaşdı.* İ.Əfəndiyev.

**DUDMAN** *is.* [*fars.*] Adlı-sanlı, tanınmış ailə, böyük ailə, nəsil. *O mənim bu dudmana nəvazişimi çox yaxşı bilir.* S.Rəhimov. // Ev, ocaq. [Dərviş:] *Mən bu dudmanı həmişə abad və içində dilşadlıq görmüşəm.* Ə.Haqverdiyev.

**DUÉL** [*fr.* əsli *lat.*] 1. *köhn.* Qabaqcadan müəyyən edilmiş şərtlərlə iki nəfərin (təhqir olunanla təhqir edənin) bir-biri ilə vuruşması və ya atışması. *Duelə çağırmaq.* – [Hüseyn:] *Gərək burada bu saat mənimlə duelə çıxasan.* Ə.Haqverdiyev.

2. *məc.* Yarış, mübahisə, mübarizə. *Gözlədim, görüm, axırı necə olacaq bu duelin.* R.Rza.

**DUELÇİ** *is. köhn.* Dueldə iştirak edən adam.

**DUET** [*ital.*] *mus.* Hər biri müstəqil olmaq üzrə ikilikdə oxunan və ya çalınan musiqi əsəri. *Leyli ilə Məcnunun dueti. – İştirak edənlərin sayından asılı olaraq hər bir belə ansamblın öz adı var. İki nəfər oxuduqda buna duet, üç nəfər* [oxuduqda] *– terset və ya trio, dörd nəfər* [oxuduqda] *– kvartet və i.a.* [deyilir.] Ə.Bədəlbəyli. *Tahir ikinci dəfə gördüyü bu filmin ariya və duetlərini artıq əzbərdən bilirdi.* M.Hüseyn.

**DUXÓVKA** [*rus.*] Qızmış hava ilə içində yemək bişirmək üçün (adətən, mətbəx plitəsi içərisində yerləşən) dəmir qutu. *Balıq duxovkada yaxşı bişir.*

**DUL** 1. *sif.* Ərinin ölümündən sonra ərə getməmiş (qadın); arvadının ölümündən sonra evlənməmiş (kişi). *Dul arvad yetim saxlar; Naxırçıya minnət qoyar.* (Ata. sözü). *Qürbət içrə fəhləliklə saxlar idi öz başın; Həm vətəndə dul anasın, yetim bacı-qardaşın.* A.Səhhət. [Mirsaqulu] *aldığı maaşla iki ailəni; özünü, iki yetimlə dul bacısını saxlayırdı.* S.Hüseyn. □ **Dul qalmaq** – əri (və ya arvadı) ölmək. [Süleyman:] *..Xala daha bu qədər dul qaldın bəsdir.* Ü.Hacıbəyov. *Ana tanıyıram iyirmi yaşından, dul qaldı; Bəlalar ötdü başından.* B.Vahabzadə. **Dul qoymaq** – birinin ərini (ya arvadını) öldürmək.

2. *is.* Dul kişi, ya dul arvad. [Məhərrəm:] *Mən dünən də demişəm, Qurban üçün qız az deyil. Birini alıb ölüb. İndi bir dul alsın və ya dul istəmir, ayrı bir qız alsın.* C.Cabbarlı.

**DULCUĞAZ** *is.* "Dul"dan *oxş.*

**DULLAŞMA** "Dullaşmaq"dan *f.is.*

**DULLAŞMAQ** *f.* Əri (və ya arvadı) ölmək; dul qalmaq.

**DULLUCA** "Dul"dan *kiç.* və *oxş.* [Sultan bəy:] *..Mənimki bir hallıca, dulluca arvaddır..* Ü.Hacıbəyov.

**DULLUQ** *is.* Dul olma, dul qadının, ya kişinin hal və vəziyyəti.

**DULUS** *is.* Saxsı qab qayıran usta. [Güllü:] *Amma hacı heç bilmir ki, məni Allah yaradıb, dəmirçi döyüb, yoxsa da dulus palçıqdan yoğurub?* Ə.Haqverdiyev.

**DULUSÇU** b a x **dulus**. *Azərbaycan etnoqrafiyasının öyrənilməsi üçün xüsusi əhəmiyyəti olan bu qab qədim dulusçuların yüksək məharətini göstərir.* (Qəzetlərdən).

**DULUSÇULUQ** b a x **dulusluq**.

**DULUSXANA** *is.* Saxsı qab karxanası.

**DULUSLUQ** *is.* Dulusun sənəti, işi, peşəsi. *Dulusluq edib sarı palçıqdan saxsı qablar qayırmaq, bu qabları naxışlamaq, bəzəmək – qoca bağbanın böyük qardaşı İbrahim Tahirin peşəsi idi.* S.Rəhimov.

**DUM** "Duma" sözünün keçmişdə danışıq dilində işlənən təhrif edilmiş forması. *Kari-şeytan dedin dəmir yolunu; Xalqa etdin həram dum pulunu.* S.Ə.Şirvani. *Sən o deyilmidin, dedin: Dumdur ümidgahımız.* M.Ə.Sabir.

**DÚMA** [*rus.*] *tar.* Rusiyada: bir sıra mərkəzi və yerli idarə orqanlarının adı. *Dövlət duması* (Rusiyada: qanunvericilik hüququna malik, seçilən nümayəndələr məclisi). *Şəhər*

*duması* (çar Rusiyasında: seçilən şəhər idarəsi orqanı, bələdiyyə idarəsi). *– Duma yenə bir məşğuliyyət idi, hərdənbir teleqramlarda vəkillərimizin nitqlərini oxuyub günümüzü bir tövr keçirirdik.* C.Məmmədquluzadə. *Şəhər duması üzvləri özləri üçün gəlir yeri tapıblar.* M.S.Ordubadi.

**DUMAÇI** *is. tar.* Dövlət, ya şəhər duması üzvü (bax **duma**).

**DUMAN** *is.* 1. Atmosferin aşağı təbəqələrində su buxarının toplanması nəticəsində əmələ gələn kəsif, tutqun hava kütləsi; sis. *Duman basmaq. Dumandan göz gözü görmür. – Dalğalanan dumanların arasından ay çıxır.* A.Səhhət. *Damla dənizdən ayrılarsa; Tez buxar olar; Göyə qalxar; Duman olar.* R.Rza.

2. Tüstü. [Orxan:] *Ey mavi göylər! Ey yaşıl ormanlar! Ey bacalardan yüksələn dumanlar.* H.Cavid. *Dumanlar, tüstülər qopmuş; Qılınclar, toplar ağzından; Həyat eşqilə odlardan, alovlardan keçir insan!* S.Vurğun.

3. Toz, tüstü və s.-nin havaya qalxmasından hasil olan tutqunluq, bulanıqlıq. *Toz, dumandan adamın gözü tutulur. – Kül rəngli havada toz, duman var; Dəhşətli soyuq, ayaz, boran var.* A.Şaiq.

4. *məc.* Bir şeyi örtən pərdə, örtü mənasında. // Bir şeyi aydın görməyə, başa düşməyə mane olan şey haqqında.

5. *məc.* Üzdə, gözdə kədər, qəmginlik, hüzn əlaməti. *Gəlin, balalarım! Öpüm sizi mən; Bir duman görməsin xoş sifətiniz.* S.Vurğun.

6. *məc.* Aydın olmayan vəziyyət, qeyri-müəyyənlik, anlaşılmazlıq, qaranlıq mənasında. *Xalqın həqiqi tarixi əfsanələr və əsatirlərin dumanları içərisində itib getmişdir.* M.S.Ordubadi. ☐ **Duman kimi (xatırlamaq, görmək** və s.**)** – aydın olmayaraq, yuxu kimi. *Dünənki gün və keçirdiyi vaxt onun yadına duman kimi gəlirdi.* İ.Musabəyov.

◊ **Başından (beynindən) duman qalxmaq** – bərk kədərlənmək, qanı qaralmaq. *Aman, aman, ayrılıq; Halım yaman, ayrılıq; Eşidəndə başımdan; Qalxır duman, ayrılıq.* (Bayatı).

**DUMAN-ÇİSKİN** bax **duman** 1-ci mənada. *Hər yeri duman-çiskin qapladı. – Ağ atlı fayton tərpəndi, zınqıldaya-zınqıldaya səs saldı, duman-çiskin içində Cavanşir qəsəbəsindən çıxıb daş yolla yuxarı dartındı.* S.Rəhimov.

**DUMANLAMA** “Dumanlamaq”dan *f.is.*

**DUMANLAMAQ** *f.* 1. Dumanla, tüstü ilə örtmək; duman, tüstü çökmək; duman, tüstü basmaq.

2. *məc.* Bulandırmaq, qaraltmaq, tutqunlaşdırmaq, kəsifləşdirmək.

**DUMANLANDIRILMA** “Dumanlandırılmaq”dan *f.is.*

**DUMANLANDIRILMAQ** *məch.* 1. Tüstüləndirilmək.

2. *məc.* Tutqunlaşdırılmaq, kəsifləşdirilmək.

**DUMANLANDIRMA** “Dumanlandırmaq”-dan *f.is.*

**DUMANLANDIRMAQ¹** *f.* 1. Tüstüləndirmək, tüstü buraxmaq.

2. *məc.* Tutqunlaşdırmaq, dumanlı etmək; anlaşılmaz, görünməz hala salmaq; üstünü örtmək.

**DUMANLANDIRMAQ²** *f.* Dumanla, tüstü ilə örtmək; duman, tüstü qaldırmaq; tüstüləmək. *Zərrintac xanım kreslodan üzüyuxarı dumanlandırdığı boz tüstünün içində sanki Xosrovun şirin sözlərini dinləyirdi.* S.Rəhimov. // *məc.* Dumanlı, anlaşılmaz hala salmaq, üstünü örtmək, pərdələmək. *Qəzetdə böyük mətləbləri dumanlandıran, xırda məsələləri şişirdən yazılar da özünə yer tapırdı.* M.İbrahimov.

**DUMANLANMA**. “Dumanlanmaq”dan *f.is.*

**DUMANLANMAQ** *məch.* 1. Dumanla (tüstü ilə) örtülmək (dolmaq); duman basmaq, duman bürümək. *Hava dumanlandı. – Toz ərşə dayandı, göy dumanlandı.* Ə.Cavad. // Duman qalxmaq, tüstü çıxmaq. *Bu sadə tonqalın yaşıl tüstüsü; Gecənin qoynunda dumanlanırdı.* S.Vurğun. // Nazik bir təbəqə ilə örtülmək, şəffaflığını itirmək, tutqunlaşmaq, kəsifləşmək. *Gözlük dumanlanaraq ətrafı görməyə mane oldu.*

2. Bulanmaq, qaralmaq. // *məc.* Gözlər haqqında – 1) yaşarmaq, doluxsunmaq, ağlamsınmaq; bərk kədərlənmək. *Qocanın dumanlanan gözləri yaşla doldu.* Ə.Məmmədxanlı. *Fəqət* [Şamilin] *nəfəsini ağır bir şey tıxamış, gözləri dumanlanmışdı.* A.Şaiq; 2) qaralmaq, qaranlıq çökmək, aydın görmə qabiliyyətini itirmək (bu mənada adətən

"gözü", "gözləri" sözü ilə). *Gözləri daha da dumanlandı; daha dərin bir xəyalata daldı*. C.Cabbarlı. *Firidun* [Musa kişinin] *işgəncədən eybəcər hala düşmüş üzünə, qurumuş dodaqlarına baxdıqda gözləri dumanlanan kimi oldu.* M.İbrahimov.

◊ **Başı (beyni, şüuru, fikri) dumanlanmaq** – 1) bir anlıq aydın düşünmə qabiliyyətini itirmək; // özünü itirmək dərəcəsinə gəlmək. [Midhəd] *fikirləşdikcə başı dumanlanır, gicgahları ağrıyırdı.* Ə.Vəliyev; // sərxoşlanmaq, keflənmək. *Qaraşın başı o qədər dumanlanmışdı ki, oturduğu yerdə dayana bilmirdi.* M.İbrahimov; 2) bərk kədərlənmək, son dərəcə məyus olmaq. *Anasının ürəkyaxıcı göz yaşından, Güllünün məğrur duruşundan Səfərin başı dumanlandı.* A.Şaiq.

**DUMANLAŞMA** "Dumanlaşmaq"dan *f.is*.

**DUMANLAŞMAQ** *f.* Dumana bürünmək, dumanla dolmaq. *Hava dumanlaşır, deyəsən, yağacaq.*

**DUMANLATMA** "Dumanlatmaq"dan *f.is*.

**DUMANLATMAQ** *f.* 1. Bax **dumanlandırmaq**. *Arabanın boynunda çöməlmiş, domuşub oturan Əsgər çırt çubuğunu qurdalayıb tüstüsünü dumanladır, hey fikirləşirdi.* Ə.Vəliyev.

2. *məc.* Qarışdırmaq, fikrini çaşdırmaq. *Qızğın ehtiraslar* [Rüstəm kişinin] *fikrini dumanlatmışdı.* M.İbrahimov.

**DUMANLI** *sif.* 1. Dumanla örtülü, duman bürümüş. *Dumanlı hava. Dumanlı göy. – Payızın dumanlı bir günü idi.* A.Şaiq. *Mən bir aşiqəm ki, bu çaldığım saz; Dumanlı dağlara səs salacaqdır.* Ə.Cavad. *Səsləyir yurdumun şeri, zinəti; Zirvəsi dumanlı o dağlar məni.* M.Dilbazi. // Tüstülü, tüstü ilə dolmuş. [Çocuqlar] *..külbə önündə oynarkən birdənbirə havanın dumanlı bir alov ilə qızardığını gördülər.* A.Şaiq. *Hüseyn göydə deyil, yığıncaqdadır; Dumanlı, tüstülü bir otaqdadır.* M.Rahim.

2. *məc.* Qarışıq, tutqun, aydın olmayan. [Şeyx Hadi:] *Tutsa afaqi şöleyi-hikmət; Onu duymaz dumanlı gözlər, əvət!* H.Cavid. *Bəşər qardaşlığı tərk etmiş, əfsus! Hər əməl dumanlı xülyaya bənzər.* S.Vurğun. // *məc.* Üstüörtülü, qeyri-müəyyən, anlaşılmaz. *Dumanlı danışıq. Dumanlı fikir. Dumanlı məsələ.*

3. *məc.* Kədərli, tutqun. *Dumanlı çöhrə. – Nümayəndələr sədrin buludlu və dumanlı üzünü gördükdə onun hələ də acıqlı olduğunu yəqin etdilər.* M.İbrahimov.

**DUMANLI-ÇİSKİNLİ** *sif.* Çox tutqun, duman və çiskin qaplamış. *Dumanlı-çiskinli hava.*

**DUMANLIQ** *is.* 1. Duman içində olan, duman qaplamış yer. *Qurd dumanlıq sevər.* (Ata. sözü). // Duman, duman kütləsi. *Çulğamışdı hər tərəfi dumanlıq.* A.Səhhət.

2. *astr*. Yerdən çox-çox uzaqlarda olan və işıqlı duman ləkələri şəklində görünən ulduz sistemləri. *Ulduzların dumanlıqlar adlanan və Qalaktikada tez-tez təsadüf olunan xüsusi qaz və toz hissəciklərindən əmələ gəldiyini fərz edənlər də vardır.* R.Hüseynov.

3. *məc.* Qarışıqlıq; qaranlıq, aydın olmayan vəziyyət. *Düzdür, insan yaranmadım, baxtım belə yazılmışdır; Bu səbəbdən bağrım başı bir dumanlıq, bir də qışdır.* S.Vurğun.

**DUMANLILIQ** b a x **dumanlıq** 1 və 2-ci mənalarda.

**DUMANSIZ** *sif.* Aydın, saf, təmiz. *Dumansız göy. Dumansız hava. – Bağçasız, barsız dağlar; Dumansız, qarsız dağlar; Mən sizə arxalandım; Siz olduz karsız, dağlar!* (Bayatı).

**DUMANSIZLIQ** *is.* Havada duman olmadığı hal; təmizlik, aydınlıq (havada).

**DUMBUL** *is.* Biri böyük, biri kiçik olmaqla ikiçanaqlı zərbli musiqi aləti. *Dumbul çalmaq. – Dumbul əvvəl ağır, sonra sürətli templə çalınardı.* H.Sarabski.

**DUMBULÇALAN, DUMBULÇU** *is.* Dumbulda çalan çalğıçı. *Dumbulçu həmin mahnının tempi ilə dumbulu çalar, iştirak edənlər də aşağıdakı mahnını oxuyardılar.* H.Sarabski.

**DUMBULÇULUQ** *is.* Dumbulçunun işi, peşəsi.

**DUM-DUM** [*coğrafi addan*]: **Dum-dum gülləsi** – ucu küt olub ağır surətdə yaralayan, qəlpələnən güllə.

**DUMDUM dumdum halvası** *dan*. – real olmayan, həqiqətdə tapılmayan, mümkün, yaxud asan olmayan şey haqqında.

**DUMDUMA** *is*. *məh*. Fırfıra.

**DUMDURU** *sif.* 1. Lap duru, büllur kimi şəffaf. *Dumduru su. – Araz gəlir daşınnan;*

*Suyu qalxır başınnan; Əzəli dumduruydu; Bulandı göz yaşınnan.* (Bayatı). *Bu səssiz dərədəsə sular axır dumduru; Mürgüləyən qayalar sanki geyib zərxara.* Ə.Cəmil. *Küçənin hər iki tərəfindən dumduru su axırdı.* Ə.Vəliyev. // Tərtəmiz, saf, aydın. *Göy üzü dumduru, hava çox saf; Parlayır mavi asiman şəffaf.* A.Səhhət. *Arxın dumduru suyu sır-sır buzları yığışdırıb apardıqca, onlar çiliklənmiş şüşə kimi cingildəyirdi.* İ.Şıxlı.

2. Lap axıcı, çox sıyıq. *Dumduru bəkməz. Dumduru bal.*

**DUMDURULUQ** *is.* Dumduru şeyin hal və keyfiyyəti.

**DUMRUQ** *is. məh.* 1. Bax **tumurcuq**.

2. Açılmayıb düymə halında olan qönçə, çiçək qönçəsi. *Alça ağacı dumruq göstərir, daha yazdır.*

3. Dəridə qabarcıqlı səpgi. *Üzü dumruqla doludur.*

**DUMRUQLANMA** "Dumruqlanmaq"dan *f.is.*

**DUMRUQLANMAQ** *f.* Tumurcuqlanmaq, tumurcuq əmələ gəlmək.

**DUMURCUQ** *is.* Damcı.

**dumurcuq-dumurcuq** *zərf* Damcı-damcı.

**DUPDURU** bax **dumduru**.

**DUPLÉT** [*fr.*] Bilyard oyununda: şar vurma üsullarından biri.

**DUR** *zərf* [*fars.*] *klas*. Uzaq, uzaq məsafədə olan. □ **Dur etmək (eyləmək)** – uzaqlaşdırmaq. *Cənnəti-vəslindən, ey canım, məni dur eyləmə.* Xətayi. **Dur olmaq** – uzaqlaşmaq. *Məzur tut, ey əziz, məzur! Mən qəsd ilə səndən olmadım dur.* Füzuli. *Qalxız başını, fikrü-xəyalatdan ol dur.* C.Cabbarlı.

**DURACAQ** *is.* 1. Nəqliyyat vasitələrinin dayanacaq yeri; duraq. *Biz gəlib duracağa çatdıq. Avtobus duracağı. – Yol üzərində bulunan duracaqların birində bir qədər dincəlmək lazım gəldi.* S.Hüseyn. *Bir qədərdən qatar duracağa çatdı.* S.Rəhimov. *Tramvayın duracağındakı adamlar nə isə deyib gülürdülər.* M.Hüseyn.

2. Son, nəhayət, axırıncı. *Duracaq qiymət.*

3. Uşağın ayaq üstə durub yeriməyi öyrənməsi üçün diyircəkli çərçivə şəklində arabacıq. *Uşaq gəzməyə başlayır, ona bir duracaq alınmalıdır.*

**DURAQ** *is.* Duracaq, dayanacaq yer, mənzil, düşərgə. *Çarvadarların duraqları karvansaralar olardı. – Çənlibel durağım, Qırat oynağım; At minməkdə arzumanım qalmadı.* "Koroğlu". *Deyirlər, qaçağın olmaz durağı...* M.Rahim. // bax **duracaq** 1-ci mənada.

**DURBİN** [*fars.*] 1. *is.* Uzaq şeyləri görmək üçün iki paralel müşahidə borucuğundan ibarət, əldə tutulan optik cihaz; binokl. *Bir də gördüm, .. səyahətçi libasında bir şəxs durbin ilə qayanın döşündəki köhnə imarətə baxır.* S.S.Axundov. *Qaçaqlar durbini tutub gözünə; Baxırdı Turqutun geniş düzünə.* H.K.Sanılı. *Öndəki zabit durbinlə sahildəkilərə, o tayda, yarğanın qaşında oturub köçü gözləyənlərə baxdı.* İ.Şıxlı.

2. *sif. klas*. Uzaqgörən. *Doğrusu, İnmirə məhəlləsinin camaatı durbin camaat idi.* N.Nərimanov. *Özünüz, şükür, durbin adamsınız.* Mir Cəlal. *Dəsturov katib təyin olunmuşdu. Bu adam çox durbin olduğundan, bəy zümrəsinə düşənlərin hamısının xüsusi bir siyahısını tutub özündə saxlayırdı.* Ə.Haqverdiyev.

**DURBİNLİ** *sif.* Durbini (binoklu) olan, əlində durbin (binokl) tutmuş. *Pəncərədən baxıb qaçır ağ durbinli xanımlar.* S.Vurğun.

**DURDURMAQ** *icb.* Durmağa məcbur etmək.

**DURĞU** *is.* Dayanma, durma, dayanış.

◊ **Durğu işarələri** *qram.* – yazıda (mətndə) sözlər və ya söz birləşmələri arasında sintaktik əlaqəni göstərən qrafik işarələr (nöqtə, vergül, iki nöqtə və s.).

**DURĞUN**[1] *sif.* 1. Hərəkətsiz, sakit. *Durğun hava. – Gecə olduqca sakit və durğun idi.* M.S.Ordubadi. *Yaz səhərinin sərin, təmiz, durğun havasında telefon elə cingildəyirdi, deyərsən, mis tiyana çaşnı tökürlər.* Mir Cəlal. *Balaca bir külək əsən kimi milyonlarca yarpaqlar xışıldayaraq durğun yay havasını sərinləşdirirdi.* S.Şamilov. // Göz, baxış haqqında. *Titrək, durğun gözlərindən; Sıcaq incilər damardı..* A.İldırım.

2. Axmayan, axarı olmayan, bir yerdə duran. *Şux səslərlə dolu isti yuvalar; Daşqın çaylar, durğun göllər bizimdir.* A.Şaiq.

**DURĞUN**[2] *is.* Yoğun bağırsağın sonu.

**DURĞUNLUQ** *is.* 1. Durğun şeyin halı; hərəkətsizlik, hərəkət etməmə. [Turxan bəy:] *Hər duruşunda, hər baxışında bir durğunluq var.* H.Cavid. *İndi* [Qısanın] *simasında intihara qərar vermiş kimi, küt bir durğunluq vardı.* Mir Cəlal.

2. *məc.* İctimai həyatda, mədəniyyətdə, təsərrüfatda və s.-də inkişafsızlıq, hərəkətsizlik. *C.Məmmədquluzadə fikri durğunluq, gerilik, cəhalət tüstüsünün xalq üçün yaratdığı qorxudan həyəcanlı danışaraq əlac etməyə çağırırdı.* M.İbrahimov. *Cəfər Cabbarlının vəfatından sonra səhnədə və dramaturgiyada bir durğunluq əmələ gəldi.* S.Rəhman.

**DURĞUZMA** "Durğuzmaq"dan *f.is.*

**DURĞUZMAQ** *f.* 1. Ayağa qaldırmaq, yerindən qaldırmaq. // Yerindən qalxmağa (durmağa) məcbur etmək. *Başqasını durğuzub yerində oturmaq. – Mansur onu durğuzub aparmaq istədisə də, Sitarə mane olub oturdu.* C.Cabbarlı.

2. Yuxudan oyatmaq. *Uşaqları erkən durğuzdular. – Sübh çox ertə oyanardı qarı; Durğuzar idi hamı xidmətkarı.* A.Səhhət. [Qulu dedi:] *..Gərək gedib Əliqulu əmini durğuzam ki, gəlib ..* [oğrunu] *tüfəngləsin.* S.S.Axundov. [Pristav dedi:] *Durğuzun bu kafir oğlunu!* Ə.Haqverdiyev.

◊ **Üzünə durğuzmaq** – əleyhinə qaldırmaq. [Şah:] *Əgər xahiş edə, qoşunun hamısını mənim üzümə durğuza bilər.* Ə.Haqverdiyev.

**DURMA** "Durmaq"dan *f.is.*

**DURMADAN** *zərf* Dayanmadan, arası kəsilmədən, ara vermədən, daim. *Yağış durmadan yağır. Durmadan danışır. Biliyinizi durmadan artırın! – Əsirdi durmadan birbaşa yellər; Döyürdü bağrını dağ-daşa sellər.* S.Vurğun.

**DURMAQ** *f.* 1. Ayaq üstə, şaquli vəziyyətdə hərəkətsiz dayanmaq. *Ağacın altında kölgədə durmaq. Güzgünün qabağında durmaq. Sahildə durub dənizə baxdıq. –* [Odabaşı Xudayar bəyə:] *..Di, burada niyə durubsan, buyur, gedək mənzilə.* C.Məmmədquluzadə. *Onlar alçaq bir divarın dibində durdular.* M.S.Ordubadi. // Bədən hissələrindən biri üzərində dayanmaq. *Başı üstündə durmaq. Əlləri üstündə durmaq. Dizi üstündə durmaq.* // Ayaq üstə durmaqla bağlı olan bir işi, vəzifəni yerinə yetirmək, bir işlə məşğul olmaq. *Dəzgah dalında durmaq. Keşikdə durmaq. Növbədə durmaq. Qarovulda durmaq. – Qalmışam eşikdə mən; Bir qızıl beşikdə mən; Yar bağçaya gələndə; Duraram keşikdə mən.* (Bayatı). *Qədir iki ay iyirmi bir gün qoruqlarda qarovul durdu.* Mir Cəlal.

2. Ayağa qalxmaq, yerindən qalxmaq, oturduğu yerdən qalxmaq. *Aclıq mənə lap kar etmişdi. Durdum ki, evimizə gedib bu arsızı doydurum.* A.Divanbəyoğlu. [Gilə] *oturduğu yerdən durub qapıya tərəf getdi.* Ə.Vəliyev. // Yuxudan ayılaraq yorğan-döşəkdən qalxmaq. *Tezdən durmaq. Gec durmaq. – Səhər durub Sabunçu məktəbinə getməyə hazırlaşdım.* A.Şaiq. *Biz hərbiyyəlilər dan üzü durmağı öyrənmişik.* Mir Cəlal. *İndi mən lap tezdən qalxıb; Qoca nənəm duranadək çay qaynadıb, süfrə açıb; Eyləyirəm ona kömək.* M.Dilbazi. // "Xəstəlikdən", "yorğan-döşəkdən" sözləri ilə – sağalıb ayağa qalxmaq, sağalmaq, yaxşı olmaq. *Xəstəlikdən təzəcə durmaq. –* [Gültəkin:] *Azardan təzə durmusan, nəfəsin qaralar.* S.Rəhimov.

3. Yerləşmək, olmaq, dikəlmək. *Pəncərənin qabağında uca bir ağac durur. Küçənin sağ tərəfində gözəl bir bina durur. Meydanda Füzulinin heykəli durur. – Gəl bahar, gəl, özünü cəbhədə zənn etmə tək; Durmuşam burda dünəndən qaya tək.* S.Rüstəm.

4. Bir şey üzərində dayanmaq, bir şeyə istinad etmək, əsaslanmaq. *Bina özül üzərində durur. Neft daşlarında vışkalar dəmir dayaqlar üstündə durmuşdur.*

5. Əyninə oturmaq, bədəninə uyğun gəlmək. *Paltar əynində yaxşı durur. Palto əynində gör necə pis durur?*

6. Dikinə qalxmaq, dik durmaq, dik vəziyyət almaq. *Tükləri biz-biz durmaq. Köynəyin yaxalığı pis nişastalanıb, yaxşı durmur.*

7. Qalmaq, dayanmaq. *Bir-iki saat burada duraq, sonra gedərik.*

8. Qərar tapmaq, rahat qalmaq, sakit qalmaq. *Bir dəqiqə bir yerdə dura bilmir. –* [Xırdaxanım:] *İndi başım yerində durmur, guya ki, mənim deyil..* N.Vəzirov. *Yerdə su durmayıb fışqırdığı kimi, mənim dərdim də daha qəlbimdə durmayır.* A.Divanbəyoğlu.

9. Müqavimət göstərmək, möhkəm dayanmaq, səbat göstərmək, tab gətirmək, dözmək. *Sən bərk dur. Düşmən qabağında durmaq. Onun qabağında dura bilməyib çəkildi. Çətinliklərin qabağında möhkəm durmaq. – Qarşımda duramaz nə sel, nə daşqın; Təbiətlə mənim zərafətim var.* M.Müşfiq. ☐ **Qabağında durmaq** – gücü çatmaq. [Fatma xanım:] *Qənd ver, çay ver, düyü də ver. Kimdi qabağında duran?* N.Vəzirov.

10. Səbat etmək, sabitlik göstərmək, geri dönmək, israr edib dayanmaq. *Sözünün üstündə durmaq.* – [Xurşudbanu:] *Bil kim, sənə söz verdim, durdum sözümün üstə.* Ü.Hacıbəyov. *Yüzbaşı dediyində dururdu.* Mir Cəlal. *Qarı sözünün üstündə durmuş və bu il iki qutu toxum götürmüşdü.* Ə.Sadıq.

11. Bir qərara gəlmək, bir nəticəyə gəlmək, bir neçə şeydən birisini qəbul edib, onun üstündə dayanmaq. *Nəhayət, trest altımərtəbəli yaşayış evinin üstündə durmuşdu.* M.İbrahimov.

12. Qalmaq, davam etmək, yaşamaq, var olmaq, mövcud olmaq; yerində qalmaqda davam etmək. *Onun babası hələ də durur. – Arxa su dolmayıb hələ; Köhnə idarəniz durur; Rəngi də solmayıb hələ.* M.Ə.Sabir. // Toxunulmamış qalmaq, işlənməmiş qalmaq, olduğu kimi qalmaq. *Aldığım pulların hamısı durur.*

13. Hərəkətsiz qalmaq, axıb getməmək. *Su bir yerdə durarsa qoxuyar.*

14. İnkişaf etməmək, artmamaq, irəliləməmək, bir yerdə qalmaq, durğunluq əmələ gəlmək. *Elm bir nöqtədə dura bilməz.*

15. İşləməmək, hərəkətsiz qalmaq, fəaliyyət göstərməmək, dayanmaq. *Maşınlar durur. Saat durmuşdur. Motor durdu. Zavod durdu.* – [Qurbanın] *qəlbi bir an durdu.* A.Şaiq. // Duracaqda, yaxud hər hansı bir yerdə dayanmaq, əylənmək. *Qatar stansiyada üç dəqiqə durur. Ekspress qatarı hər stansiyada durmur. Maşın evimizin qabağında durdu. – Arabamız bir alaçığın ağzında durdu.* A.Şaiq. *Furqon hərəkətə hazır bir halda durmuşdu.* M.İbrahimov. // Öz işini, məşğələsini və s.-ni dayandırmaq, arasını kəsmək. *Kitabın 20-ci səhifəsində durdum. Söhbətin ortasında durdu. Keçən dərsdə hansı paraqrafda durmuşduq?*

16. Bitmək, kəsilmək, ara vermək, dayanmaq, sakit olmaq. *Yağış durdu. Atışma durdu.*

17. Çaşıb qalmaq, heyrət içində qalmaq, duruxmaq, duruxub qalmaq. *Xəbəri eşidən kimi durdu.*

18. Gözləmək, səbir etmək, toxtamaq, tələsməmək, dayanmaq. *Bir az dur. Dura bilmirəm. Sən bir dur. Durmaq vaxtı deyil.* – [Şahsənəm:] *Qulun olum sənin, gülüzlü xacə; Degilən Qəribə durmasın, gəlsin.* "Aşıq Qərib". *Şəkli alıb qaçdım yoldaşımın yanına: – Faiq, hələ durmusan, məgər durmalı əsrdir?* C.Məmmədquluzadə. [Salman:] *Qonaq qardaş, dur! Təlaş etmə sən.* H.Cavid.

19. Diqqəti bir şeyin üzərində saxlamaq, dayandırmaq, onun haqqında müfəssəl danışmaq, bəhs etmək. *Bu məsələnin üzərində çox durmaq lazımdır.*

20. Yer tutmaq, mövqe tutmaq. *Tərbiyə məsələsi birinci yerdə durur. Qarşıda ciddi problemlər durmaqdadır.*

21. Müəyyən şərtlərlə bir işi, vəzifəni yerinə yetirməyi öhdəsinə götürmək, bir işə girmək. [Aslan] *nökər durmaq istədi, uşaq olduğu üçün heç kəs ona beş manatdan artıq pul vermədi.* C.Cabbarlı. [Papaqçı dedi:] *– Bala, mənə şəyird durarsanmı? Rəsul dedi: – Nə üçün durmuram.* "Aşıq Qərib".

22. Başa gəlmək, mal olmaq, tamam olmaq, oturmaq. *Palto mənə 150 manata durdu. – Təbrizə Rusiyadan ticarət malı gətirilməyəcəkdir. Gətirilsə də, çox ağır qiymətə duracaqdır.* M.S.Ordubadi.

23. Qalxmaq, çıxmaq, törəmək. *Qəmzəsindən fitnələr durdu, oyandı uyqudan.* Nəsimi. *Gün ki sayən düşdüyü yerdən durar, bir vəchi var.* Füzuli.

24. Qalmaq. *Qədir, sənin can naloqundan nə qədər durur?* Mir Cəlal.

25. Hərəkət etmək, davranmaq. *Qoy bizə gülməsin nə dost, nə də yad; Ehtiyatlı danış, ehtiyatlı dur!* S.Vurğun.

26. Başlamaq, girişmək, təşəbbüs etmək. *Durdu mənimlə mübahisəyə. Durdu ağaca çıxdı.* – [Hacı Nuru:] *..Sən əbəs yerə özünü saldın qalmaqala, durdun onun ilə, bunun ilə döyüşməyə, xalqın dalısınca yaman sözlər*

*danışmağa.* M.F.Axundzadə. *Başına durdu qoydu əmmamə; Geydi nəleynini ol əllamə.* S.Ə.Şirvani.

27. "Belə", "bu yana", "o yana" və s. sözlərlə – çəkilmək. *O yana dur, keçim.* – [Nurcahan:] *..Qapıdan belə dur, vallah, yoxsa bir oyun oynaram, tamam şəhər tökülər.* N.Vəzirov.

28. **...dursun, ...belə dursun, ...bir yana dursun** – ...kənarda qalsın, ...bir tərəfdə qalsın, ...sərf-nəzər edərək, ...haqqında danışmayaraq. *Tanımaq bir yana dursun, heç adını eşitməmişəm. – Rüstəm dursun, onlara Səyavuş verir cavab.* H.Cavid.

29. İnkar şəklində: **durmamaq** – dayanmamaq, qalmamaq. *Bu bağçada quş durmaz; Yaz gələndə qış durmaz; Küsmüsən, gəl barışaq; Mənim dilim dinc durmaz.* (Bayatı). *Çeşmi-xumarın görəndə; Can çıxar, durmaz bədəndə; Mey içib sərxoş gəzəndə; Dönüb məstanə bir baxmaz.* Q.Zakir. // Tökülmək, yerindən çıxmaq. *Başında saçı durmur. – Öküz qocalmışdı, ağzında bir dişi durmurdu, ..ətlikdən savayı heç şeyə yaramırdı.* S.Rəhimov. ☐ **Geri durmamaq** – hər bir şey etməyə hazır olmaq, heç bir tədbir qarşısında durmamaq, hər cür tədbirə əl atmaq.

30. İnkar şəklində, ikinci və üçüncü şəxslərdə: **durma(yın)** – tələs(in), tez ol(un), dayanma(yın), gecikmə(yin). *Qabla dəxi mafraşını, Mir Haşım! Durma, götür qaç başını, Mir Haşım!* M.Ə.Sabir. [Tərxan:] *Durmayın, haqlayın vurulmuş ovu.* A.Şaiq. // Hərəkətə gəl(in), sakit durma(yın). *Ey könül, sən də həvəslən, durma!* M.Müşfiq. // Tez, təcili, yubanmadan. *Keçən həftə getmişdim şəhər idarəsindən paşburt alam; çünki səfərim var, anam tel göndərib: durma, gəl.* C.Məmmədquluzadə. [Lütfəli:] *Mən ölüm, durma, gəl, səni gözləyirəm.* İ.Musabəyov.

31. Feli bağlamalara qoşularaq vəziyyətin davamlılığını bildirir. *Dayanıb durmaq. – Başımı aşağı dikib durduğum halda, əlimdəki çörək qismətin yumruğumda saxlamağa başladım.* A.Divanbəyoğlu. *Xəstə sayıqlayır, hərəkət içində çırpınıb dururdu.* M.İbrahimov.

32. Feli bağlama şəklində bir sıra feillərin əvvəlində bir işə təşəbbüs etmək, başlamaq mənasını ifadə edir. *Durub söyləmək. Durub qaçmaq. Durub mənə belə dedi... Durum baxım, görüm.* – [Firidun] *bir ildırım sürəti ilə .. durub qaçmaq istəyirdi.* M.İbrahimov. [Əminə:] [Həmzə] *Nikolayın Nuh əyyamından durub mənə danışır.* Ə.Əbülhəsən.

◊ **Durma gəldim** – tez, tələsik, birbaşa, üz tutaraq. *Kəblə Novruzqulu başmaqlarını ayağına geyərək, durma gəldim birbaş Hacı Abtalıbın yanına gedir.* H.Sarabski. **Durub-durub** *zərf* – hərdənbir, arabir, ara-ara. *Gülüş durub-durub ah çəkirdi..* S.Rəhimov. **Durub-oturmaq (əyləşmək)** yaxud **oturub-durmaq** – birisi ilə vaxt keçirmək, əlaqə saxlamaq, yoldaşlıq etmək, dostluq etmək. *Əbəs yerə cəfa çəkmə, yar olmaz; Rəqib ilə durub-oturan sənə.* Q.Zakir. [Mirzə Qədir] *hər zaman böyük adamlarla durub-əyləşirdi.* S.Hüseyn. [Ağca] *xüsusilə zəmanəyə mənsub oxumuşlar, firqəçilər, ziyalılar ilə durub-oturmağı arzu edirdi.* Mir Cəlal.

**dura-dura** *zərf* ...olduğu halda, ...durduğu halda, ...ola-ola. *Qeyrətimə sığışdıra bilmirəm ki, mən dura-dura və mən olan yerdə, məndən savayı bir özgə adam gəlib burada bir ad çıxartsın; gəlib Tiflisdə şöhrət qazansın.* C.Məmmədquluzadə. *Məncə, əsil qəhrəman da dar ağacı gözünün qabağında dura-dura, dediyindən dönməyənlərdir.* M.İbrahimov. [Bülənd:] [Veys] *dura-dura mənə evlənmək yararmı?* Ə.Əbülhəsən.

**DURMAQAÇ** *zərf dan.* Tez, tələsik, təcili, birnəfəsə.

**DURMAQSIZIN** bax **durmadan**.

**DURNA** *is. zool.* Dimdiyi, boğazı və ayaqları uzun köçəri iri bataqlıq quşu. *Qatar-qatar olub qalxıb havaya; Nə çıxıbsız asimanə, durnalar?!* M.V.Vidadi. *Durnalar dəstə-dəstə göydə uçar; Oxuyar nəğmələr, cənuba qaçar.* A.Səhhət. *Göylərin yolçusu durna qatarı, Süzəcək süzdüyün dumanlıqları.* M.Müşfiq.

◊ **Durna boğazı** *məc. şair.* – durnanın boğazı kimi uzun və zərif. *Mahirə .. durna boğazını yuxarı tutaraq çağırdı: – Sarxan! Sarxan!* M.Hüseyn. **Durna gözü kimi** *məc. şair.* – çox təmiz, saf, şəffaf, bərraq, dupdu-

ru mənasında. *Ortalıqda qoca, kühənsal bir ağac altında da Qoşabulaq durna gözü kimi qaynayır, göz yaşı kimi axıb ətrafı süd gölünə döndərir.* "Koroğlu". *Gözəl olur bizim elin yayları; Durna gözü kimi vardır bulağı.* A.Şaiq.

**DURNABALIĞI** *is. zool.* Şirin sularda yaşayan yastı və uzunsov başlı yırtıcı balıq. *Suyun özünün və çayın dibinin rəngindən asılı olaraq, durnabalıqları tutqun və ya sarımtıl yaşıl rəngdə olur. Bədəninin uzunsov oxşəkilli olması və quyruq hissəsinin yaxşı inkişaf etməsi nəticəsində durnabalığı cəld və diribaş hərəkət edir. "*Zoologiya*"*

**DURNABOĞAZ(LI)** *sif.* Uzun boğazı olan, uzunboğaz.

**DURNAGÖZ(LÜ)** *sif. şair.* 1. Gözəl, aydın gözləri olan. [Gülsənəm:] *Kəndimizdəki durnagözlü qızları ürkütməklə saymaq olmur.* M.Hüseyn.

2. *məc.* Təmiz, saf, dumduru mənasında. *Çox keçmişəm bu dağlardan; Durnagözlü bulaqlardan.* S.Vurğun. *Cənub tərəfdə durnagözlü duru və soyuq bulaqların şırıltısı insanı valeh edirdi.* Ə.Vəliyev.

**DURU** *sif.* 1. Maye halında olan, su kimi axıcı, sıyıq. *Duru yanacaq. Duru palçıq. Duru xörək.* // Həddindən artıq sıyıq olan, suyu çox olan, sulu. *Duru qatıq. Duru dovğa.*

2. Saf, təmiz, şəffaf, aydın. *Vətənimin göyləri göllərindən durudur; Qoynunda səadətin sarayları qurulur.* R.Rza. [Nuriyyə:] *Mən arxın büllur kimi duru suyu ilə üzümü yuyub sərinləndim*. İ.Əfəndiyev. *Narın birini kəsdim. Zoğal kimi iri, əqiq kimi duru giləlləri var idi.* Mir Cəlal. // Məc. mənada. [Uluq bəy:] *..Çeşmədən durusan, şəfəqdən oynaq; Belə mərd qızlarla gülər hər ocaq.* A.Şaiq. [Zeynal:] *Çiçək kimi qız saxlayıb böyütmüşəm. Sudan duru adı var.* C.Cabbarlı. *..Qız eyni duru və riyasız gözlərini ani olaraq* [Xavərin] *gözlərinə dikdi və tez çəkdi.* M.İbrahimov. // Açıq. *Hava gözəl olduğundan, Gülzarın yanaqları daha da xoşrəng olub, duru al bir rəng almışdı.* C.Cabbarlı.

3. *məc.* Əsil, xalis, təmiz, xərc və zərər çıxılandan sonra qalan. *Duru qazanc.*

4. "Durusundan" şəklində *dan.* – ən yaxşısından, ən yaxşı yerindən, ən təmizindən. *Düyünün durusundan 5 kilo çək. – Darğa Lələş .. xırman vaxtı durusundan, qırmızı zoğalından öz buğda bəhrəsini tək bircə dəninə qədər tamam-kamal alar*(*dı*). S.Rəhimov.

◊ **Duru yerindən** – b a x **duru** 4-cü mənada. **Duruya çıxar(t)maq** – təmizə çıxar(t)maq, safa çıxar(t)maq, bəraət qazandırmaq, doğrultmaq. *Kəlbalı nə qədər çalışırdısa da, .. özünü duruya çıxara bilmirdi.* S.Rəhimov. **Kefi duru olmaq** – b a x **kef**.

**DURUXDURMA** "Duruxdurmaq"dan *f.is.*

**DURUXDURMAQ** *icb.* Duruxmağa məcbur etmək, duruxmasına səbəb olmaq; çaşdırmaq, karıxdırmaq, təəccübləndirmək. *Bu sual* [Əbülhəsən bəyi] *duruxdurdu.* M.S.Ordubadi.

**DURUXMA** "Duruxmaq"dan *f.is. Mən onların duruxmasına hirsləndim.* Mir Cəlal.

**DURUXMAQ** *f.* Fikrə getmək, söz axtarmaq, düşünmək. *Gözlərin kimi gözlər; Duruxub kimi gözlər?* Sarı Aşıq. *..Sadıq bir az duruxub cavab verdi ki, lağlağı onun ayamasıdır.* C.Məmmədquluzadə. [Məşədi bəy] *duruxdu, gülümsünərək daha ifadəli bir söz tapdı.* M.Hüseyn. // Tərəddüd içində durub fikrə getmək, dayanmaq. [Davud] *bir az duruxandan sonra öz sözünü izah etdi.* Mir Cəlal. // Çaşan kimi, özünü itirən kimi olmaq, tutulmaq, döyükmək. *Zeynal geniş bir şüşəbəndi keçib yemək odasına girdi, bir qədər duruxdu.* S.Hüseyn. *İkisi də əvvəl duruxdu, döyükdü və sonra nifrətəngiz bir heyrətdə donub qaldılar.* Çəmənzəminli. *Hüseyn duruxdu, nə cavab vermək lazım gəldiyini bilmədi.* S.Rəhman.

**duruxa-duruxa** *zərf* Dayana-dayana, dura-dura, arabir duraraq. *Cəlal qabağında kitab duruxa-duruxa oxuyur.* C.Məmmədquluzadə. [Həsən] *..çənəsi ilə ağacına söykənərək duruxa-duruxa cavab verir..* Mir Cəlal.

**DURUXSU(N)MAQ** b a x **duruxmaq**. *..Xidmətçi qadın gəlib* [qapını] *açdı. Məni görürkən duruxsundu.* M.S.Ordubadi. *Cəfər qarpızı hirslə yerinə qoyub geri çəkildi, qiymətini azaltmaq üçün bir-iki addım da qızdan uzaqlaşdı. Sonra duruxsuyub Rüstəm bəyə dedi.* Çəmənzəminli.

**DURULAMA** "Durulamaq"dan *f.is.*

**DURULAMAQ** *f. dan*. Aydınlaşdırmaq, müəyyənləşdirmək. *O, çötkəni qabağına çəkdi, çırt yoxuşa, çırt enişə, haqq-hesabı durulayıb aydınlaşdırdı.* S.Rəhimov.

**DURULANMA** "Durulanmaq"dan *f.is.*

**DURULANMAQ** *f.* Duru olmaq, duru hala gəlmək, durulmaq; şəffaflanmaq. *Su durulandı.*

**DURULAŞDIRILMA** "Durulaşdırılmaq"-dan *f.is.*

**DURULAŞDIRILMIŞ** *f.sif.* Duru hala gətirilmiş.

**DURULAŞDIRMA** "Durulaşdırmaq"dan *f.is.*

**DURULAŞDIRMAQ**, *f.* Duru hala salmaq; şəffaflaşdırmaq. *Suyu durulaşdırmaq.*

**DURULAŞMA** "Durulaşmaq"dan *f.is.*

**DURULAŞMAQ** *f.* 1. Duru olmaq, sıyıqlaşmaq, durulanmaq. *Doşab durulaşdı. Mürəbbə durulaşdı.*

2. Durulmaq, saflaşmaq, aydınlaşmaq. *Dünya durulaşır ana səsindən; Eh, neçə illərdir onsuzam, gülüm.* M.Araz.

**DURULDUCU** *sif.* Durulaşdıran, saflaşdıran. *Zəy suyu durulducu maddədir.*

**DURULDULMA** "Duruldulmaq"dan *f.is.*

**DURULDULMAQ** *məch*. Duru hala salınmaq, duru edilmək.

**DURULDULMUŞ** *f.sif.* Durulaşdırılmış, duru hala salınmış.

**DURULMA** "Durulmaq"dan *f.is.*

**DURULMAQ** *f.* 1. Duru olmaq, duru hala gəlmək, saf və təmiz hala düşmək. *Bulanıq suya zəy vurulanda durulur. – Araz buruldu, getdi; Suyu duruldu, getdi; Mən dedim, yar incidi; Demə yoruldu, getdi.* (Bayatı). *Boz səhralar çiçək açır, sular durulur; Dağlar üstə dağlar qoyur insan hünəri.* S.Vurğun.

2. Axıcı hala düşmək, sıyıqlaşmaq. *Bəkməz isinəndə durulur. Mum əriyəndə durulur.*

3. *məc.* Aydınlaşmaq, açılmaq. *Hava durulur. – Gecə yarı günəş doğur.. zülmət durulur.* S.Vurğun. *Dünənki bərk qardan sonra gün çıxmış, hava durulmuşdu.* Mir Cəlal.

4. *məc. dan*. Açılışmaq, halı yaxşılaşmaq, rəngi açılmaq. – *Gəl əyləş, mey içək, keflər durulsun; Koroğlu çağırır dövrana səni.* "Koroğlu".

**DURULTMA** "Durultmaq"dan *f.is.*

**DURULTMAQ** *f.* Duru hala salmaq; saflaşdırmaq, şəffaflaşdırmaq. *Çayın suyunu durultmaq. Kürün suyunu duruldub içirlər.*

**DURULUQ** *is.* 1. Duru şeyin halı; saflıq, şəffaflıq. *Suyun duruluğu.*

2. Sıyıqlıq. *Bəkməzin duruluğu.*

3. *məc.* Aydınlıq, açıqlıq. *Lakin biz onun gözünə baxarkən aydınlıqdan və duruluqdan başqa bir şey görməzdik.* M.İbrahimov.

**DURUM**[1] *is.* 1. Davam, dözüm, tab, səbat. *Amma* [Həmzə] *zarıyırdısa da, deyəsən, yalvarmaq fikrində deyildi və onun belə durumu Veysi özündən çıxarırdı.* Ə.Əbülhəsən. // Güc, qüvvət. *Heç olmasa, bir-iki tikə yeyərəm, evə çatana qədər ürəyimdə durum olar.* "M.N.lətif." // Davamlılıq, möhkəmlik, doyumluluq, qidalılıq.

2. Dayanacaq, duracaq yer.

**DURUM**[2] *is.* Çox bərk narın torpaq, qum. *Bir azdan sonra durumla dolu bir vedrə çəkdilər və vedrəni yenə quyuya salladılar.* C.Cabbarlı.

**DURUMLU** *sif.* Durumu olan, davamı olan, tutarı olan. *Durumlu xörək.* // Dözümlü.

**DURUMLULUQ** *is.* Durumlu şeyin halı. *Yeməyin durumluluğu.*

**DURUMSUZ** *sif.* Durumu olmayan. *Sanılı pul durumsuz* (z.) *olar*. (Ata. sözü).

**DURUMSUZLUQ** *is.* Durumsuz şeyin hal və keyfiyyəti.

**DURUŞ** *is.* 1. Durma tərzi, durma vəziyyəti, özünü tutma tərzi. ..*Başında göy araxçın, duruşunda əzəmət; Üzündə qəm izləri, gözlərində məhəbbət*. B.Vahabzadə. *Zürafə boynuna bənzərdi boynu; Məğrur, ədalı bir duruşu vardı..* H.Cavid. *Duruşun mənalı, baxışın dərin; Mən bu dərinlikdə tapdım baxtımı.* M.Müşfiq.

2. Dayanacaq, duracaq. *Duruş məntəqəsi*. – *Tramvay duruşunda təyyarə bığlı bir gənc; Zilləyib gözlərini bir qapıya səhərdən.* S.Rüstəm.

◊ **Duruş gətirmək** – səbir etmək, dözmək, davam gətirmək, dayanmaq. *178 və 179-cu atıcı polklar .. gəncəlilərin qabağında duruş gətirməyib geriyə – öz əvvəlki mövqelərinə çəkildilər*. İ.Şıxlı. **Duruş vermək** – b a x **duruş gətirmək**. ..*Adam duruş verib bir yerdə dura bilmir.* Ə.Əbülhəsən.

**DURUŞMA** "Duruşmaq"dan *f.is.*

**DURUŞMAQ** *f.* Bir qaydada durmaq (çoxları haqqında).

**DURUŞ-OTURUŞ** *is.* Hal və hərəkət, hərəkət tərzi; əda. *Lakin* [Erkək Tükəzbanın] *sifətinə bir az yaxından diqqət verəndə və duruşuna-oturuşuna baxanda adama bir növ yapışqanlıq gəlir.* B.Talıblı. [Uçitel] *gecə kurslarından və kəndə yayılan zümzümələrdən sonra .. Mürsəlin xəbəri olmadan onu gözdən qoymur, oturuşuna-duruşuna fikir verirdi.* İ.Şıxlı.

**DUST**[1] [*fars.*] *klas.* b a x **dost**. *Sənə nərgiz təki valeh olan mən; Ki, hüsnün surəti-rəhmandır, ey dust!* Xətayi. *Ol lalərüx olmaz bizə nə dust, nə düşmən; Əğyar ilə bihudə bu qovğadan usandıq.* S.Ə.Şirvani.

**DUST**[2] *is. kim.* Toz halında dezinfeksiya maddəsi.

**DUSTAQ** *is.* 1. Həbs olunmuş, yaxud dustaqxanada saxlanılan adam; məhbus. *Dustaqlar gözdən qeyb olanacan camaat dallarınca baxırdı.* Ə.Haqverdiyev. *Qadın yalnız dustaqlara deyil, bəzən üç nəfər qarovul üçün də yemək gətirirdi.* M.S.Ordubadi. *Məşədi Şərəf danışdıqca Qüdrətov yazır, hərdən dayanıb dustağın sifətinə baxırdı.* Ə.Vəliyev. // *məc.* Məhbus kimi oturub evdən bayıra çıxmayan, xarici aləm, cəmiyyət ilə əlaqəsi olmayan adam haqqında. [Nina Xumara:] *Daima evdə, sanki bir dustaq; Nə olur bir çıxıb hava alsaq!* H.Cavid. // *klas.* Əsir mənasında. *Bülbüli-şeyda gülün, pərvanə şəmin dağıdır; Binəva könlüm, ki bir dilbilməzin dustağıdır.* Qövsi. ☐ **Dustaq etmək (eləmək)** – həbs etmək, həbsə salmaq, azadlıqdan məhrum etmək; // *məc.* bir yerə salıb nəzarət altında saxlamaq, bayıra çıxmağa qoymamaq. *Qaraca qız duydu ki,* [mürəbbiyə] *Ağca xanımı evə salıb dustaq etdi.* S.S.Axundov. [Səfər:] *İndi bir ay, üç həftə, iki gündür ki,* [Səriyyəni] *burada dustaq eləyiblər.* C.Cabbarlı. **Dustaq olmaq** – məhbus olmaq, həbsə düşmək, həbsə salınmaq, dustaqlıqda olmaq. *İl yarım dustaq olandan sonra qurtarıb gəldi və başladı evlərdə mərsiyə oxumağa.* C.Məmmədquluzadə. [Reyhan:] *Həm insafdırmı, Elçinin anası, əlsiz-ayaqsız bir qadın zindanlarda dustaq olsun?..* M.Hüseyn; // *məc.* dustaq kimi bir yerdə oturub bayıra çıxmamaq, yaxud bu və ya başqa səbəbə görə bayıra çıxa bilməmək.

2. Həbsxana, həbs, qazamat, həbs yeri, dustaqlıq. [Qubernator:] *Dustaqdan bir şey çıxmaz, burada qan lazımdır.* C.Cabbarlı. *Dustaqdan qayıtdı, görmədi qızı; Qaldı ürəyində hər söz, hər arzu.* Z.Xəlil.

**DUSTAQBAN** [dustaq və *fars.* ...ban] *köhn.* b a x **dustaqçı**. *Kürdlərdən biri dustaqbana yaxınlaşıb, qoca dustağı dalısına alıb aparmağı xahiş etdisə də, xahişi qəbul edilmədi.* P.Makulu.

**DUSTAQÇI** *is.* Dustaqxana nəzarətçisi. [Elxan:] *Artıq tələsin, dustaqçı indicə qayıdacaqdır.* C.Cabbarlı.

**DUSTAQÇILIQ** *is. dan.* 1. Dustaqlıq, dustaqla olma, dustaqlıq dövrü.

2. Dustaqçının vəzifəsi, işi.

**DUSTAQXANA** *is. köhn.* Həbsxana, həbs evi, qazamat. *Dustaqxanaya salmaq. – Mənim adətimdir: bir dustaqxana adı gələndə, gərək iki ağaclığından qaçam, yox olam.* C.Məmmədquluzadə. *Şaban gedən günü Məşədi Məmmədəli, arvadı Gülsüm, neçə nəfər dost-aşna gedib yığıldılar dustaqxananın qapısına.* Ə.Haqverdiyev.

**DUSTAQLIQ** *is.* Həbsdə saxlanılan, yaxud həbs edilmiş adamın halı; məhbusluq. [Mürsəl:] – *A, müəllim, üzüm də səndən qara, bizim uşaq dustaqlıqdan kağız yollayıb. Bir oxuyun görək nə yazıb?* İ.Şıxlı.

**DUSTANƏ** *zərf* [*fars.*] *klas.* Dostcasına, dost kimi. *Yad et məni, dustanə yad et.* A.Səhhət.

**DUŞ**[1] [*fr.*] 1. Su müalicəsi və ümumiyyətlə, çimmək üçün yuxarıdan su səpələyən cihaz, alət. [Tahir] *sonra tamam çılpaqlaşıb, özünü soyuq duşun altına verdi.* M.Hüseyn.

2. Su cərəyanı vasitəsilə bədənə təsir etməkdən ibarət müalicə üsulu. *Bədənə su tökmək və duş qəbul etmək orqanizmə qüvvətli təsir göstərir.*

**DUŞ**[2] *is. qəd.* Yuxu, röya. [Kərəm:] *Bilməm xəyalmıdır, yoxsa duş kimi; Gəldi keçdi boran kimi, qış kimi.* "Əsli və Kərəm". *Yatmışdım, aşkar gördüm duşumu; Əzəlindən mən bilirdim işimi.* "Koroğlu".

**DUŞXANA** *is.* [*fr.* douche və *fars.* ...xanə] Duş düzəldilmiş yer, duş qəbul edilən yer.

**DUTSAQ** "Dustaq" söz. qədim forması.

**DUVAQ** *is.* 1. *etnoqr.* Gəlin gedən qızın üzünü örtən tül örtü. *Gül düxtərinin ərusi yetmiş; Gülgün duvağın başına örtmüş.* Xətayi. *Artıq Gülzarı başında ağ duvaq qapıdan çıxarırlardı.* C.Cabbarlı. // Ümumiyyətlə, keçmişdə qadınların başlarına taxıb üzlərini gizlətdikləri şəffaf örtü. *Zülf töküb üzə dilbər; Çıxıbdır düzə dilbər; Duvaq salın üzünə; Gəlməsin gözə dilbər.* (Bayatı). *Yanağın yanında zülfə tov vermiş; Ucun sancmış tər duvağın üstündən.* M.P.Vaqif.

2. *məc.* Təşbehlərdə "örtü" mənasında. *Qapqara bir duvaqla örtülmüşdür göy saray.* R.Rza.

**DUVAQQAPMA** *is. ədəb.* Xalq dastanlarının axırında, adətən, gəlini tərifləyən və ona nəsihət verən aşıq şeri. *Şadlıq məclisində ustad aşıq sazı döşünə basıb bu duvaqqapma ilə onların toyunu bağladı.* "Lətif şah". *Ustad bir aşıq onların dastanını aşağıdakı duvaqqapma ilə bağladı.* "Əmrah".

**DUVAQLAMA** "Duvaqlamaq"dan *f.is.*

**DUVAQLAMAQ** *f.* Üzünə duvaq çəkmək.

**DUVAQLANMA** "Duvaqlanmaq"dan *f.is.*

**DUVAQLANMAQ** *məch.* Üzünə duvaq çəkilmək.

**DUVAQLI** *sif.* Üzündə duvaq olan, üzüduvaqlı. *Bir yandasa ağ eyvanlı təzə binalar; Ağ duvaqlı gəlin kimi gendən gülürdü.* Ə.Cəmil.

**DUVAQLIQ** *sif.* Duvağa yarayan. *Duvaqlıq tül.*

**DUVAQSIZ** *sif.* Duvağı olmayan. // *zərf* Duvağı olmadan, duvaq örtmədən, üzüaçıq. *Qızlar, qadınlar indi duvaqsız gəzirlər.*

**DUYDURMA** "Duydurmaq"dan *f.is.*

**DUYDURMAQ** *icb.* Hiss etdirmək, sezdirmək, sözsüz başa salmaq, bildirmək.

**DUYĞU** *is.* 1. Obyektiv aləmin hadisələrini qavrama, hiss etmə qabiliyyəti; hiss. *Duyğu orqanları.*

2. Öz hissləri, təəssüratı əsasında bir şeyi qavrama, dərk etmə, başa düşmə qabiliyyəti. *İnsani duyğular. Hörmət duyğusu. Məsuliyyət duyğusunu itirmək.*

3. Sezmə, anlama, başa düşmə qabiliyyəti.

**DUYĞULU** *sif.* İncə duyğusu olan, tez və yaxşı duyan, hiss edən. *Duyğulu adam.*

**DUYĞUSUZ** *sif.* 1. Duyğusu olmayan, heç bir şeyi hiss etməyən, duymayan, yaxud duyğusu kütləşmiş. // Üzgünlükdən, yorğunluqdan bayğınlıq dərəcəsinə gəlmiş. [Şeyx Hadi:] *Suda bir xeyli qol-qanad çaldıq; Həp yorulduq da, duyğusuz* (z.) *qaldıq..* H.Cavid.

2. *məc.* Həyata, hadisələrə, varlığa laqeyd baxan, onları dərk etməyən, heç bir şeydən təsirlənməyən. *Dastanlar yaradaq, dastanlar yazaq; Gələcək duyğusuz deməsin bizə.* S.Vurğun.

**DUYĞUSUZLUQ** *is.* Duyğunun olmadığı hal; hissizlik.

**DUYLUQ: özünü duyluğa qoymaq** *dan.* – özünü bilməməz kimi göstərmək, özünü bilməməzliyə qoymaq. *Bu ittifaqda qız qəsdən özünü duyluğa qoyacaqdır ki, guya mən sizi heç elçi bilməyirəm, adi qonaq bilirəm.* R.Əfəndiyev.

**DUYMA** "Duymaq"dan *f.is. Duyma qabiliyyəti.*

**DUYMAQ** *f.* 1. Hiss etmək, hiss üzvlərinin biri vasitəsilə qavramaq. *Ləhzə həvəsindən uymaz idim; Günüzlə gecəni duymaz idim.* Xətayi. [Qarışqalar] *evlərinin möhkəm olmayacağını duyub, quru divarları dağıdırlar və təzədən palçıq gətirib, divar qalxızmağa və tağ vurmağa başlayırlar.* H.Zərdabi. [Əhməd:] *Zənn edirəm ki, ürəyimin döyünməsini Gülnaz da duyur və eşidirdi.* T.Ş.Simurq.

2. Sezmək, anlamaq, başa düşmək, ürəyinə dammaq. [İskəndər:] *Hey, Zeynəb, vallah, fəndini duymuşam! Qonağın yolunda bu qədər çalışırsan ki, ərin Kərbəlayı Novruzu da diriltsin?* C.Məmmədquluzadə. *Səlim bəy ortalıqdakı dolaşıq vəziyyəti duydu və ayağa qalxaraq əlini pristavın yıldızlı umuzuna qoyaraq dedi..* H.Nəzərli.

**DUYUXMA** "Duyuxmaq"dan *f.is.*

**DUYUXMAQ** *f.* 1. Ayılmaq, ayıq düşmək, başa düşmək, duymaq. *..Yatışan itlər duyuxmasın deyə, qəsdən daxmalardan uzaqlaşıb şenliyin baş tərəfindən dərəyə gedən araba yoluna çıxdılar.* M.Hüseyn.

2. Duruxmaq, çaşmaq, ürkmək. *Ələmdar duyuxmuş halda geriyə çəkildi.* S.Rəhimov.

**DUYUQ** *sif.* 1. Duyğu hissi iti olan, tez duyan, ayıq.

2. Xəbər. *Kəndə duyuq yayıldı.*

◊ **Duyuq düşmək** – duymaq, xəbər tutmaq, xəbərdar olmaq. *Adamlar bu işdən duyuq düşdülər. Bunlar divardan aşanda qazamat qulluqçuları duyuq düşdülər.* "Qaçaq Nəbi". *Duyuq düşsə əgər verməzlər rüsxət; Unutma, gah-gahi düşəndə fürsət.* Q.Zakir. [Yusif:] *Onsuz da bizim işçilər duyuq düşüblər, onları gözdən qoymurlar.* S.Rəhman. **Duyuq salmaq** – ayıltmaq, xəbərdar etmək. *Xırda çıxışlarda bulunmaq isə düşməni vaxtından əvvəl duyuq sala bilər.* M.S.Ordubadi. *Bir soldatı öldürərsə, düşmənin zabitini duyuq salıb əldən çıxara bilərdi.* Ə.Əbülhəsən. **Duyuq vermək** – b a x **duyuq salmaq**. *Qaraxan papirosunun kötüyünü sümürdü və: – Bəs niyə axşamdan duyuq verməmisən, – dedi, – isti-isti axtaraydıq.* S.Rəhimov.

**DUYUQLUQ** *is.* Tez duyma, tez hiss etmə, tez başa düşmə qabiliyyəti, ayıqlıq, sayıqlıq.

**DUYUQSUZ** *sif.* 1. Duyma qabiliyyəti olmayan.

2. *zərf* Xəbərsiz, xəbəri olmadan. *Kəndlilərin hamısı bir-birindən duyuqsuz halda yavaşca dedilər..* Ə.Vəliyev.

**DUYULMA** "Duyulmaq"dan *f.is.*

**DUYULMAQ** *məch.* Hiss edilmək, sezilmək, başa düşülmək. *Çadırdan-çadıra qonaq gəzərdin; Yazıq! Duyulmadı sənin də dərdin.* S.Vurğun. *Bağda rütubət qarışıq iydə ətri duyulurdu.* İ.Əfəndiyev. *Məhəbbət sezildi nənə səsində; Nənə rəftarında şəfqət duyuldu.* M.Rahim.

**DUYULMAZ** *sif.* və *zərf* Duyula bilməyən, hissedilməz; sezilə bilməyən. *Ürəkdə qaldı məramım, duyulmaz oldu səsim.* H.Cavid.

**DUYUŞ** *is.* Duyma. *Qaz duyuşu.*

**DUZ** *is.* 1. Xörəyi dada gətirmək üçün ona qatılan kəskin dadlı, şor ağ kristal maddə. *Xörək duzu.* □ **Daş duzu** – b a x **daşduz**. *..Duzu dağlardan daş kəsən kimi kəsirlər ki, belə duza daş duzu deyirlər.* H.Zərdabi. **Dəniz duzu** – dəniz suyunu buxarlandırma yolu ilə hasil edilən duz. **Duzuna baxmaq** – şit və ya şor olduğunu bilmək üçün xörəyin dadını yoxlamaq, dadmaq.

2. *kim.* Turşu hidrogeninin bütünlüklə, ya qismən metalla əvəzlənməsi məhsulundan ibarət olan kimyəvi birləşmə, maddə. *Bertole duzu.*

3. *məc.* Sözə, danışığa kəskinlik verən, onu daha da maraqlı edən xüsusiyyət; dad, ləzzət, məzə. *Nitqində duz yoxdur. Sözünün duzu yoxdur.* // *məc.* Özünü sevdirəcək xüsusiyyət, cazibə. *Onda duz yoxdur.*

◊ **Çörəyinin duzu olmamaq** – qədri bilinməmək, zəhmətinə qiymət verilməmək. **Duz kimi yalamaq** – çox əzizləmək, bağrına basaraq hədsiz mehribanlıq göstərmək, qucaqlaşmaq, çoxlu öpmək. [Əzim baba] *Səlimin boynunu qucaqlayıb onu duz kimi yaladı.* S.Rəhimov. *Kəramət uşaq əzizləyən, balasını duz kimi yalayan analardan deyildi.* Ə.Əbülhəsən. **Duza qoymaq** – 1) şoraba qoymaq; 2) *məc.* lüzumsuz yerə işlətməyib saxlamaq. **Duzunu dadmaq** – 1) birinin çörəyini yemək; 2) təsirini görmək, hiss etmək. *Bu hərif, deyəsən, mənim materialımın duzunu dadmayıb.* "Kirpi". **Duzunu qaçırmaq** – bayağılaşdırmaq, ləzzətdən çıxarmaq, rəğbətdən salmaq.

**DUZAQ** *is.* Quş və vəhşi heyvan tutmaq üçün alət; tələ, cələ. *Tülkü iki dəfə duzağa düşməz.* (Ata. sözü). // *məc.* Hiylə, kələk, tələ. *Təhlükə bilməyən, duzaq bilməyən; Qorxusuz yolçular, ulu yolçular.* R.Rza. □ **Duzaq qurmaq** – tələ qurmaq, tor qurmaq, kələk düzəltmək. *Yar oldu verdiyin fərman və bayraq; Düşmənə qurmuşam çıxılmaz duzaq.* A.Şaiq.

**DUZ-ÇÖRƏK** *is.* 1. Duz və çörək. *Ağsaqqal-cavan, qoca-qarı, gəlin-qız hamı əllərində duz-çörək altdan-yuxarı çıxmağa başladı.* Ə.Vəliyev.

2. *məc.* Yaşama vəsaiti, dolanacaq üçün zəruri olan şeylər; çörək, yemək-içmək.

◊ **Duz-çörək basmaq** – dostluğa zidd iş görmək, dostluğa xəyanət etmək, sədaqəti pozmaq. **Duz-çörək gözündən gəlsin!** – qarğış ifadəsi. [Sənəm:] *Əlimlə sənə verdiyim duz-çörək sənin gözündən gəlsin!* Ə.Haqverdiyev. **Duz-çörək haqqı** – and ifadəsi. **Duz-çörək itirmək** – edilən yaxşılıq qarşısında pislik etmək, yaxşılığı yaddan çıxarmaq, vəfasızlıq etmək. **Duz-çörək kəsmək** (bəzən "bir yerdə", "bir süfrədə" sözləri ilə) – dostluq etmək. *Atan Hacı Cəfər ilə duz-çörək*

*kəsmişəm, özü də çox dindar bir kişidir*. S.S.Axundov. *Onlar .. bir süfrədə oturub duz-çörək kəsmişdilər.* S.Rəhimov. [Ballı:] *Biz Alxanla .. duz-çörək kəsmişik.* İ.Əfəndiyev. **Duz-çörək tökmək** – b a x **duz-çörək itirmək**. [Hafizə xanım:] *Mən duz-çörək tökən adamı saxlamaram.* Ə.Haqverdiyev. **Duz-çörək yemək** – b a x **duz-çörək kəsmək**.

**DUZÇU** *is.* 1. Duz istehsalatı işçisi.

2. Duzsatan.

**DUZÇULUQ** *is.* Duz istehsalı, duz istehsal etmə.

**DUZDAQ** b a x **duzlaq**. [Yaşar:] *..Kəndimizin yanında ucsuz-bucaqsız geniş düzən vardır. O, duzdaqdır*. C.Cabbarlı.

**DUZƏX** *is.* [*fars.*] Cəhənnəm. *Duzəxə girməz sitəmindən yanan; Qabili-cənnət degil əhli-əzab.* Füzuli. *Gedərəm duzəxə mərdü mərdanə; Əsli budur sözün sağı, səninlə.* Q.Zakir. *Və onların hamısından pisi budur ki, duzəxdə bir əqrəb var ki, onun başı yeddinci göyə gedib çatır.* C.Məmmədquluzadə.

**DUZXANA** *is.* Təbii halda çıxarılan duzu qaynadıb xörəyə işlənmək üçün yararlı hala gətirən karxana.

**DUZQABI** *is.* İçinə duz tökmək üçün kiçik qab; nəməkdan. *Duzunu dadıb, duzqabını sındırmaq yaramaz.* (Ata. sözü).

**DUZQIRAN** *is. xüs*. Duz mədənlərində sal duzu qırıb çıxaran fəhlə. // Sif. mənasında. *Duzqıran maşın.*

**DUZLADILMA** "Duzladılmaq"dan *f.is.*

**DUZLADILMAQ** "Duzlatmaq"dan *məch.*

**DUZLAQ** *is.* 1. Duz olan yer, duz mədəni. *Şoranlıq duz duzlaq kimi ağarır, acı duz qoxusu beyinləri çatladırdı.* S.Rəhimov.

2. Duz çıxarmaq üçün dəniz kənarında əmələ gətirilən və ya təbii halda olan göl. *Duzlağa buraxılan dəniz suyu günəşdə qurudulur, dibdə qalan duz toplanır*.

3. Sürüyə, heyvanlara duz verilən yer. *Bu heyvanlar* (*maral, cüyür, təkə və s.*) *üçün qoruğun müxtəlif yerlərində 20-yə qədər üstüörtülü daimi duzlaqlar təşkil edilmişdir.*

**DUZLAMA** "Duzlamaq"dan *f.is.*

**DUZLAMAQ** *f.* 1. Bir şeyin üstünə duz səpmək, duz vurmaq. *Xörəyi duzlamaq. Balığı duzlamaq. – ..İsti tərəflərdə əti saxlamaqdan ötrü duzlayıb, qurudub hisə verirlər*. H.Zərdabi.

2. Duz məhlulunda hazırlamaq. *Xiyarı, kələmi duzlamaq.* // Duz hopdurmaq, duzlu suya və ya duza batırmaq. *Gönü duzlamaq*.

**DUZLANDIRILMA** "Duzlandırılmaq"dan *f.is.*

**DUZLANDIRILMAQ** *məch*. Duzlu hala gətirilmək, duzlu edilmək, duzluluğu artırılmaq.

**DUZLANDIRILMIŞ** *f.sif.* Duzlu hala gətirilmiş, tərkibindəki mineral duzun miqdarı artırılmış.

**DUZLANDIRMA** "Duzlandırmaq"dan *f.is.*

**DUZLANDIRMAQ** *f.* Duzlu hala salmaq, duzlu etmək.

**DUZLANMA** "Duzlanmaq"dan *f.is.* ☐ **Torpağın duzlanması** – torpaqda münbitliyə mane olan mineral duzların artması.

**DUZLANMAQ** 1. *məch*. Duz vurulmaq, üstünə duz səpilmək.

2. *məch.* Canına duz hopdurulmaq.

3. *t-siz*. Duzlar əmələ gəlmək, tərkibində mineral duzların miqdarı artmaq.

**DUZLANMIŞ** *f.sif.* 1. Duz vurulmuş, duz səpilmiş. *Duzlanmış ət*.

2. Saxlamaq üçün duzlu suya qoyulmuş; duzlu. *Duzlanmış xiyar, kələm.* // Canına duz hopdurulmuş. *Duzlanmış dəri*.

**DUZLAŞDIRILMA** "Duzlaşdırılmaq"dan *f.is.*

**DUZLAŞDIRILMAQ** *məch*. Duza çevrilmək, duz halına gətirilmək.

**DUZLAŞDIRMA** "Duzlaşdırmaq"dan *f.is.*

**DUZLAŞDIRMAQ** *f.* Duza çevirmək, duz halına gətirmək.

**DUZLAŞMA** "Duzlaşmaq"dan *f.is.*

**DUZLAŞMAQ** *f.* Duza çevrilmək, duz halına gəlmək, duz kimi olmaq; şoranlaşmaq.

**DUZLATDIRMA** "Duzlatdırmaq"dan *f.is.*

**DUZLATDIRMAQ** b a x **duzlatmaq**.

**DUZLATMA** "Duzlatmaq"dan *f.is.*

**DUZLATMAQ** "Duzlatmaq"dan *icb. Balıqları, əti duzlatmaq.*

**DUZLAYICI** *is.* İstehsalatda məhsulları duzlamaqla məşğul olan işçi, fəhlə.

**DUZLU** *sif.* 1. Tərkibində duz olan; şor. *Duzlu göl. Duzlu su. Xəzər dənizinin ətrafında duzlu göllər çoxdur.*

2. Kifayət qədər və ya lüzumundan artıq duzlanmış, duz vurulmuş; şor. *Duzlu pen-*

*dir*. // Duza, duzlu suya qoyulmuş, duz hopdurulmuş. *Duzlu xiyar, kələm.*

3. *məc.* Xoş, ürəyəyatan, sevimli, xoşagələn, qanışirin, suyuşirin, yapışıqlı, cazibəli. *Duzlu adam. O qız çox gözəl deyil, amma duzludur.* // *məc.* Çox məzəli, çox maraqlı. *Sabir! Ey, ən sevimli şairimiz; Müqtədir, duzlu, sözlü Sabirimiz!* A.Səhhət. *Hər sözü, söhbəti duzlu, məzəli; Süzür kəklik kimi ellər gözəli*. S.Vurğun. *Sabirin duzlu və gülməli şeirləri oxucular arasında çox hörmət qazanmışdı.* M.Arif.

**DUZLUCA** *sif.* 1. Daha çox duzlu. *Duzluca pendir.*

2. *məc.* Xoşagələn, şirin, yaxşı. *Duzluca söhbət.*

**DUZLUQ** *is.* 1. B a x **duzqabı**.

2. B a x **duzlaq**.

**DUZLUQÖLÇƏN** *is. xüs*. Bir məhlulun duzluluq dərəcəsini müəyyən etmək üçün cihaz.

**DUZLULUQ** *is.* 1. Duzlu şeyin halı; şorluq. *Suyun duzluluq dərəcəsi.*

2. *məc.* Ürəyə yatmağa, xoşa gəlməyə səbəb olan xüsusiyyət; qanışirinlik, suyuşirinlilik, yapışıqlılıq.

**DUZSEVƏN** *sif.* Duzlu torpaqlarda yaxşı bitən. *Duzsevən bitkilər*.

**DUZSUZ** *sif.* 1. Duzu olmayan, duz vurulmamış, yaxud duzu az. *Duzsuz xörək. Şorba yaman duzsuzdur.*

2. *məc. dan*. Şit, bayağı, xoşagəlməz, qanısoyuq. *Duzsuz adam*. // Maraqsız, mənasız. *İclas çox soyuq və duzsuz* (z.) *qurtardı.* Ə.Vəliyev. *Xüsusən axırıncı sözlər Bünyada çox duzsuz* (z.) *gəldi.* Ə.Əbülhəsən.

**DUZSUZLANMA** "Duzsuzlanmaq"dan *f.is.*

**DUZSUZLANMAQ** b a x **duzsuzlaşmaq**.

**DUZSUZLAŞDIRILMA** "Duzsuzlaşdırılmaq"dan *f.is.*

**DUZSUZLAŞDIRILMAQ** *məch*. Duzsuz hala gətirilmək, duzdan təmizlənmək.

**DUZSUZLAŞDIRMA** "Duzsuzlaşdırmaq"dan *f.is.*

**DUZSUZLAŞDIRMAQ** *f.* Duzsuz hala gətirmək, duzdan təmizləmək, duzunu çıxarmaq.

**DUZSUZLAŞMA** "Duzsuzlaşmaq"dan *f.is.*

**DUZSUZLAŞMAQ** *f.* Duzsuz hala gəlmək, duzu çıxmaq, duzu qaçmaq.

**DUZSUZLUQ** *is.* 1. Duzsuz şeyin halı.

2. *məc.* Şitlik, bayağılıq, xoşagəlməzlik; qanısoyuqluq.

**DÜ** *say* [*fars.*] İki (ancaq nərd oyununda işlənir).

**DÜA** b a x **dua**.

**DÜBARƏ** *zərf* [*fars.*] 1. İkinci dəfə, təkrar. *Dübarə gəldi, yenə getdi. – Bu halda həyətdə dübarə qalmaqal qopur*. M.F.Axundzadə. *Yusifin sanma dübarə görə Yəqub üzünü.* X.Natəvan. *Fərhad Aslanın sualına cavab vermədi. Aslan dübarə soruşdu..* C.Cabbarlı. *Herbert tapşırığını verib yenicə qurtarmışdı ki, Əhməd dübarə içəri girib təzim elədi.* Ə.Vəliyev.

2. B a x **dülər**.

**DÜBBƏ** *is. köhn. dan*. Masqaraçı, oyunbaz.

**DÜBBƏDÜZ** *sif.* Dümdüz, tamamilə düz.

**DÜBBƏLİK** *is. dan*. Masqaraçılıq, oyunbazlıq. *Siz bu dübbəlikdən nə kimi ləzzət alırsınız?* M.S.Ordubadi.

**DÜBBİ-ƏKBƏR** *is.* [*ər.*] *klas*. Böyük ayı bürcü.

**DÜBBİ-ƏSĞƏR** *is.* [*ər.*] *klas*. Kiçik ayı bürcü.

**DÜBEYT** *is.* [*fars.* dü və *ər.* beyt] *ədəb.* 1. İki beytdən ibarət olan lirik şeir forması.

2. Saz (aşıq) havalarından birinin adı. *Dübeyt oxumaq. – Aşığın çaldığı bir dübeyt dərhal onu mütəəssir edir.* O. Sarıvəlli.

**DÜBƏDÜ** *zərf* [*fars.*] *dan*. İkilikdə.

**DÜBƏND(İ)** *is.* [*fars.*] *köhn.* Ayaqqabı növü. [Molla Qasım] *ayağına qara meşindən dikdaban Təbriz dübəndisi və bəzi vaxt sarı rəngli nəleyin geyərdi.* H.Sarabski.

**DÜBƏRD**: **dübərdini dağıtmaq** *dan*. – divan tutmaq.

**DÜÇAR** *sif.* [*fars.*] Mübtəla, tutulmuş. *Naçaram, mən naçaram; Yaman dərdə düçaram.* (Bayatı). ☐ **Düçar etmək** – üz-üzə gətirmək, rastlaşdırmaq, məruz qoymaq, uğratmaq. [Hacı Qara:] *Amma bu zəmanədək* [qanınızı] *tökən olmayıb, indi sizi əcəl çəkəçəkə mənə düçar edibdir!* M.F.Axundzadə. *Fəda olum sənə, Seyyid sənin qulamındır; Bu qədr zillətə etmə onu düçar, ey dust!* S.Ə.Şirvani. [Xırdaxanım:] *..Dərbədər olsun məni bu evə düçar eyləyən!* N.Vəzirov. **Dü-**

**çar olmaq** – 1) mübtəla olmaq, tutulmaq, başına gəlmək. *Bir belə bəlalara düçar olan, başı qovğalar çəkən, əlbəttə, gərək intiqam fikrini başından çıxarmaya.* Ə.Haqverdiyev. [Molla Seyfulla] *böyük müsibətə düçar olmuş adam kimi, hərdənbir dərindən ah çəkib, "əstəğfürullah" deyir.* T.Ş.Simurq. *Yaşardı gözlərim, oldum o gündən eşqə düçar.* H.Cavid; 2) rast gəlmək, rastlaşmaq, üz-üzə gəlmək, təsadüf etmək. *Su kənarında qəflətən naçar; Bir quzu bir gün oldu qurda düçar.* A.Səhhət. [5-ci məhbus:] *Ağa dərviş, bəlkə sən Şah Abbası görmüş olasan, çünki çox vaxt dərviş dərvişə düçar olmaq kimidir.* Ü.Hacıbəyov; 3) məruz qalmaq, uğramaq, üz vermək. *Nə möhnətdir, bu möhnət bilmirəm, Heyran düçar olmuş.* Heyran xanım. *Bunların yaşadıqları kənd müharibə cəbhəsinə yaxın olduğundan böyük xəsarətlərə düçar olmuşdu.* T.Ş.Simurq.

**DÜDƏK** bax **düdük**. *Çomaq əldə dolaşır dağı, daşı; Qoyun, quzu, köpək, düdək yoldaşı.* A.Şaiq.

**DÜDƏMƏ** *sif.* və *is.* 1. İki cinsdən törəmiş; mələz. *Qatır düdəmə heyvandır.*

2. İkiağızlı; iri. *Düdəmə bıçaq*.

**DÜ-DÜ-DÜ** *təql.* Toyuq, xoruz və cücələri çağırmaq üçün çıxarılan səs. *Ovcumu dən ilə doldurub "dü-dü-dü!" səslədiyim zaman hər yerdə olsalar* [toyuq və cücələr] *qanad çalıb yanıma gələrdi.* A.Şaiq.

**DÜDÜK** *is.* 1. Qarğıdan və s.-dən qayrılan, nəfəslə çalınan ən sadə çalğı aləti; ney. *Bir qədər keçəndən sonra musiqiyə olan həvəsim o qədər azaldı ki, başıbəlalı düdüyü bilmərrə gözdən saldım.* C.Məmmədquluzadə. *Sevgili bir çoban, on bir yaşında; Düdük çalar axar sular başında*. H.Cavid. *Həftələrlə çöllərdə xəsillər* (*əkin*) *arasında tor quran quşçular bildirçin düdüyü* (*giyid*) *çalmaqla erkək bildirçini aldadıb tutardılar.* H.Sarabski.

2. Zavod, fabrik, parovoz və s.-nin fit borusu. *Fəhlələrin istirahət günündə ulduzlar batmadan onları yuxudan qaldıran zavod düdüklərinin səsi gəlmirdi.* M.S.Ordubadi. // Ümumiyyətlə, borucuq, boru şəklində olan şey.

3. *məc.* Çox dar şalvar (paltar) haqqında.

4. *köhn*. Beşikdə uşağın sidiyini sirbincə axıdan borucuq.

5. *məc. dan. isteh*. İradəsiz, düşüncəsiz, tezaldanan, yelbeyin, boş adam haqqında (bəzən söyüş kimi işlənir). *Düdüklər! Yorulmadan çağırınız bizləri, Təqib edəcəyiz bir hərəkətlə sizləri.* M.Müşfiq.

◊ **Düdük vermək (gəlmək)** – yalan vədlər verməklə başını tovlamaq.

**DÜDÜKÇALAN, DÜDÜKÇÜ** *sif.* və *is.* 1. Düdük çalan çalğıçı. [1-ci mücahid:] *Ay düdükçülər, .. düdükləri işə salın görək.* M.S.Ordubadi.

2. *məc. dan*. Adamaldadan, yalan vədlər verməyi özünə peşə etmiş adam.

**DÜDÜKÇÜLÜK** *is.* 1. Düdükçünün (1-ci mənada) işi, peşəsi, məşğuliyyəti.

2. *məc. dan*. Adam aldatma xasiyyəti.

**DÜDÜLƏMƏ** "Düdüləmək"dən *f.is.*

**DÜDÜLƏMƏK** *f.* "Dü-dü" deyərək ev quşlarını çağırmaq. *Toyuqları düdüləmək.*

**DÜGAH** *is.* [*fars*.] Musiqi muğamlarından birinin adı.

**DÜHA** *is.* [*ər.*] 1. İnsan zəkasının, istedadının ən yüksək zirvəsi; xariqüladə ağıl və zəka; dahilik. [Xumar:] *Oxunur gözlərində nuri-düha; Yüksəl, ey şeyx! Gəl, düşünmə daha!..* H.Cavid. *Füzuli öz dühası ilə Azərbaycana parlaq klassik bir ədəbiyyat verdi.* C.Cabbarlı. *Hələ bizim Azərbaycan torpağından; Nə dühalar, nə günəşlər yaranacaq. Oxuyuram istiqbalı varaq-varaq*. S.Vurğun.

**DÜHALI** *sif.* Dühası olan, dühaya malik olan.

**DÜXİŞ** *is.* [*fars.*] *k.t. dan*. Əkin yerinə iki dəfə cüt sürmə.

**DÜXTƏR** *is.* [*fars.*] *klas*. Qız. *Gözəllikdə gəlsə düxtəri-Misri; Səni ondan min ziyadə deyərlər.* "Abbas və Gülgəz". *Görmədinmi, necə o Şeyx Sənan; Düxtəri-tərsayə xidmətkar olmuş!* Q.Zakir.

**DÜJÜN** [*rus.*] On iki eyni növ şeyin ədədi, on iki eyni növ əşyadan düzəldilmiş dəst, komplekt. *Bir düjün qaşıq* (12 dənə qaşıq). [Məşədi Səttar:] .. *Onun malının siyahısı həmişə yadında qalar. Mən ərz eləyim: on girvənkə yağ, bir düjün karandaş, bir banka zoğal mürəbbəsi...* Ə.Haqverdiyev.

**DÜKAN** *is.* [*ər.*] 1. Mal satmaq üçün kiçik bina, kiçik mağaza. *Qəssab dükanı. Çörək dükanı. – ..Biz deyirik, cümə günlərini tətil eliyək, dükanlarımızı bağlayaq və alış-verişə məşğul olmuyaq.* C.Məmmədquluzadə. [Həmzə:] *Qurban! Səfəri apar, bu tin dükandan bir kəllə qənd al, ver ona, gətirsin, gedək axundun yanına.* C.Cabbarlı.

2. Bəzi sənətkarların işlədikləri və hazırladıqları şeyləri satdıqları yer, kiçik bina. *Bıçaqçı dükanı. Dəmirçi dükanı. Çəkməçi dükanı. – Çayçı dükanının dal tərəfində qumarxana olardı.* H.Sarabski. *Bahadır çayçı dükanının qabağında bir-iki yük maşınına yaxınlaşdı.* S.Rəhman. ☐ **Dükan açmaq** – özü üçün dükan düzəldib alverlə məşğul olmağa başlamaq. *Qəzvinə varid olandan sonra .. dükan açdı, öz kəsbi ilə özünü və əyalını saxlamağa məşğul oldu.* M.F.Axundzadə.

**DÜKAN-BAZAR** *is.* Dükanlar olan yer, bazar, çarşı. *Dükan-bazar bağlanıbdır. – Bir su içim saatda bütün dükan-bazar qaldı başına.* "Koroğlu".

**DÜKANÇA** *is.* Kiçik dükan.

**DÜKANÇI** *is.* Dükan sahibi, dükan saxlayan, dükanda alış-verişlə məşğul olan adam. *Dükançılar bir-birinə dəydi, dükanlar bir anın içində bağlandı.* A.Şaiq. *Abbas qırdığı odunu şələləyib bazarda dükançılara satırdı.* S.S.Axundov. *..Dükançılar, baqqallar da, deyəsən, bu axşam həmişəki adətlərini yadlarından çıxarmışdılar.* Ə.Əbülhəsən.

**DÜKANÇILIQ** *is.* Dükançı peşəsi, dükançının işi, məşğələsi; dükan alverçiliyi.

**DÜKANDAR** [*ər.* dükkan və *fars.* ...dar] 1. *köhn.* b a x **dükançı**. *Üç adam bir stolun başında oturub çilov yeyirdi.. Onlardan biri onu* [Firidunu] *bir dükandar, yaxud xırda tacir zənn edərək, ayağa durdu..* M.İbrahimov.

2. Dükanda satıcı. [Dadaş:] *Biz balaca bir dükandarıq, üzümüz danlağa öyrənibdir..* S.Rəhimov. *Dükandar irəli yeridi ki: "xahişiniz nədir?"* Mir Cəlal.

**DÜKANDARLIQ** b a x **dükançılıq**.

**DÜKÇƏ** *is. məh.* Cəhrənin iyinə sarılan yumaq. *Qarı gündə bir dükçə ip əyirir.*

**DÜLBƏRÇİN** *is. məh.* Yonca növlərindən birinin adı.

**DÜLƏR** *is.* [*fars.*] Nərd oyununda: hər iki zərin iki (dü) göstərməsi.

**DÜLGƏR** *is.* Taxtadan qapı, pəncərə kimi şeylər qayıran usta. *Atam allaf, babam dülgər idi.* M.Ə.Sabir. *Tapdıq gah taxta yonan dülgərlərə, gah təkərləri yoxlayıb mazutlayanlara, gah da dəyə çubuğu seçib təmizləyənlərə göstəriş verirdi.* İ.Şıxlı.

**DÜLGƏRXANA** *is.* Dülgər emalatxanası.

**DÜLGƏRLİK** Dülgər sənəti, işi, peşəsi. *Dülgərlik etmək. – Və o gündən artıq* [Haşım] *dülgərlik sənətini öyrənməyə çalışırdı.* B.Talıblı. // Taxtadan müxtəlif şeylər qayırma. [Rəsul] *bir qədər irəli gedib gördü ki, bir kişi qabağına bir qədər taxta yığıb dülgərliklə məşğuldur.* "Aşıq Qərib".

**düm...** – bəzi mürəkkəb sifətlərin əvvəlində şiddət bildirən hissəcik, məs.: dümağ, dümqara, dümsarı.

**DÜMBƏ** *is.* [*fars.*] İkiçarxlı, təkatlı arabada at qoşulan ağacın arxa tərəfi. *Kəblə Novruzqulu qoyunun .. əl-ayağını bağlayıb arabanın dümbəsinə qoyardı.* H.Sarabski.

**DÜMBƏK** b a x **dumbul**. *Dümbək çalmaq. – Nə tüfəngə çaxmaq, nə dümbəyə toxmaq.* (Ata. sözü).

**DÜMBƏKÇALAN, DÜMBƏKÇİ** *is.* Dümbək çalan adam, dumbulçu. *Dümbəkçi hərdən gözünü oturanlara çevirincə: "Can, ay atam balası, can!" – deyən səslər ucalırdı.* Mir Cəlal.

**DÜMBƏKÇİLİK** *is.* Dümbəkçinin işi, peşəsi; dumbulçuluq.

**DÜMBƏLƏK** b a x **dümbək**.

**DÜMBƏLƏKÇİ** b a x **dümbəkçi**.

**DÜMBÜRİDƏ** *sif.* [*fars.*] *köhn.* Lümək, quyruğukəsik.

**DÜMDÜZ** *sif.* Çox düz, tamamilə düz. *Dümdüz çöl. Dümdüz ağac. Dümdüz qamət. – Hündür, dümdüz şam ağaclarının qol-budağı üşüyürmüş kimi qar təpələri altında titrəşirdi.* M.İbrahimov. *Dəniz sakit, şüşə kimi; Dümdüz idi mavi sular.* M.Dilbazi. // Zərf mənasında. *Çovğun gecə dümdüz edir yer üzün; Qar işığı gündüz edir yer üzün.* A.Səhhət. *İnsan oğlu gecələri; Şəhər salır, boz dağları; Qüdrətilə dümdüz edir.* M.Rahim. // Dik, dikinə. *Stolun qabağında dümdüz oturmuş uzunboğaz, arıq adam qəti*

*dedi..* M.Hüseyn. [Qədir] *qulluq məqamında donmuş kimi dümdüz dayandı.* Mir Cəlal.

**DÜMƏLƏNMƏ** "Dümələnmək"dən *f.is.*

**DÜMƏLƏNMƏK** *f. dan.* Əlləşmək, vurnuxmaq, nə isə bir şeylə məşğul olmaq. *Dünən gecədən kürkünə birə düşmüş Tükəzban, nə edəcəyini bilmirmiş kimi, həyətdə dümələnirdi.* Ə.Abasov.

**DÜMƏRDİ** *is.* [*fars.*] *köhn.* İkiadamlıq. [Ağa Mərdan:] *Ağa Kərim, bizim nökərlərdən birisini göndər, bazardan çilovpəzdən 4 nəfər üçün dörd dümərdi boşqabda yanında qəndabi çilov gətirsin.* M.F.Axundzadə.

**DÜMGAH** *is.* [*fars.*] *məh.* Quşqunun atın quyruğu altından keçən hissəsi.

**DÜMQARA** *sif.* Qapqara, zil qara, tamamilə qara.

**DÜMSÜK** *is.* 1. Dirsək, yumruq, yaxud burunla, ya da başqa bir şeyin ucu ilə vurma, itələmə; dürtmələmə. *Buzov burnu ilə anasının yelininə dümsük vurur. Bir dümsük vurdu.*

2. Başqaları hiss etmədən yavaşca dirsəklə vurma. *Ona bir dümsük vur, ağzına gələni danışmasın. – Ə, ağzını niyə açmırsan? – deyə Hüseyn Yusifə bir dümsük vurdu..* Ə.Abasov.

**DÜMSÜKLƏMƏ** "Dümsükləmək"dən *f.is.*

**DÜMSÜKLƏMƏK** *f.* 1. Dirsəklə, yumruqla, yaxud burunla, ya da başqa bir şeyin ucu ilə vurmaq, itələmək, dürtmək. *Gecənin bir vaxtı elə bildim ki, uşaqların anası məni dümsüklüyür.* C.Məmmədquluzadə. *Leyla dirsəyi ilə nənəsini dümsüklədi.* Ə.Məmmədxanlı.

2. *məc.* Danlamaq, məzəmmətləmək; burunlamaq.

**DÜMSÜKLƏNMƏ** "Dümsüklənmək"dən *f.is.*

**DÜMSÜKLƏNMƏK** *məch.* 1. Dümsüklə vurulmaq (itələnmək).

2. *məc.* Danlanmaq, məzəmmətlənmək.

**DÜMÜK** *is. dan.* Məşğələ, məşğuliyyət. ☐ **Dümük olmaq** *dan.* – bir şeylə vaxt keçirmək, vaxtını öldürmək.

**DÜMÜŞMƏK** *f. məh.* Çöməlmək, çöməlib oturmaq; sallağı oturmaq. [Dərviş:] *Buzovu onun qabaq ayaqlarına bağladı, özü də inəyin sağrısına dirsəkləndi, mən dümüşüb sağmağa başladım.* A.Divanbəyoğlu.

**DÜN** *is.* Dünən. *Dün gecə. Dün axşam. – Dün gəda idim və lakin sahibi-cəhan bu gün.* Kişvəri. *Dün gecə fələkə çıxdı fəryadım.* M.P.Vaqif. *Nə dil qaldı, nə dildə taqətim; dün şəb eşitdim kim; Edibdir ta səhər əğyar ilə ol dilrüba məclis.* S.Ə.Şirvani. *Bir açıq yerdə dün axşam burası; Yaşayanlardan uzaq bir yerdi.* M.Müşfiq.

**DÜNƏN** *is.* Bu gündən əvvəlki gün, keçən gün, irəliki gün. *Dünən hava yaxşı idi. Dünən axşam. – Dünən öləni dünən basdırdılar.* (Ata. sözü). *Rəfiqəmiz dünən bir vacib işdən ötrü gəlmişdi idarəmizə..* C.Məmmədquluzadə. *Hər şeyi o qədər aydın görüb hiss edirəm ki, elə bil, bunlar hamısı dünən, srağagün baş vermişdi.* İ.Əfəndiyev. // Yaxın, ya uzaq keçmiş. *Bunlar hamısı dünənə aiddir.* // Zərf mənasında. *Dünən gəlmişəm. Məzuniyyətim dünən qurtardı.*

**DÜNƏNKİ** *sif.* Dünən olmuş, bir gün əvvəl vaqe olmuş, baş vermiş. *Dünənki yağış. Dünənki hadisə. Dünənki iclas uzun çəkdi. – Dünənki gün də gün idi, bu gün də bir gündür.* S.Ə.Şirvani. [Muzdurun] *nitqi kəsildi, ay aman, olmaya ki, dünənki çamadan əhvalatıdır.* S.M.Qənizadə. // Yaxın, ya uzaq keçmişdəki, əvvəlki, olub bitmiş. *Bu, dünənki məsələdir. Dünənki işləri yada salma. – Dünənki boz çöllərdə; Axar zümrüd kimi su.* M.Seyidzadə.

**DÜN(Ü)GÜN** *zərf, klas.* Gecə-gündüz, daima. *Düngün fəraqindən gözüm yaş tökərü qan axıdar.* Nəsimi. *Əmma dünükün fəğan edərdi; Xunabi-cigər rəvan edərdi.* Füzuli.

**DÜNKÜ** b a x **dünənki**. *Nərdə onu yaşadan dünkü parlaq ehtişam, Onu öldürən kəndi sinifinin yolumu?* M.Müşfiq.

**DÜNYA** *is.* [*ər.*] 1. Bir küll olaraq maddənin bütün formalarının məcmusu; kainat. *Dünyanın əmələ gəlməsi.*

2. Yer kürəsi, yer üzü, aləm. D*ünyanın qitələri. Dünyanı dolaşmaq. Dünyada elə bir qüvvə yoxdur ki, bizə qalib gəlsin. – Bütün dünyanı gəzsən, yenə də belə at tapa bilməzsən.* "Koroğlu". *Dünyada gözəl çoxdu; İlqar birinən gərək.* Sarı Aşıq. *Əsrlər uzunu Azərbaycan qızlarının toxuduğu al-əlvan xalılar dünyanın çox ölkələrində yayılmış və şöhrət tapmışdır.* M.İbrahimov. // Bizi əha-

tə edən aləm, bütün varlıq, bütün canlılar; mühit. *Qaranlıq çökdü, bütün dünya sükuta qərq oldu. – ..Dünyada bəzi vaxt, bəlkə də çox vaxt, çox təəccüblü işlər ittifaq düşür..* C.Məmmədquluzadə. [Fitnə:] *Dünyada istedad, hər böyük hünər; Daima vərdişlə inkişaf edər.* A.Şaiq. // Yer üzünü, dünyanın bütün xalqlarını əhatə edən və ya bütün dünya üçün əhəmiyyəti olan. *Dünya müharibələri. Dünya tarixi. Dünya bazarı. Dünya hadisələri. Dünya rekordu. – Bunlar çox zaman qapı qabağında görüşürlər, dünya müharibəsindən, qıtlıqdan, zülmdən, zalımdan söhbət edirlər.* S.Rəhman. // Dini təsəvvürlərə görə, əbədi sayılan "o dünyaya" (axirətə) müqabil olaraq müvəqqəti sayılan yaşadığımız aləm. *Bivəfa dünyada, dəhri-fənada; Fələk məni yetirmədi murada.* M.V.Vidadi. *Seyyida, eylə fərəh, çəkmə bu dünya qəmini; Çünki beşgünlük olur bülbülişeydadə fərəh.* S.Ə.Şirvani. [Dərviş:] *Ey cavan, otuz ildir mən dünyadan əl çəkib, gözümü axirət qapısına dikmişdim.* A.Divanbəyoğlu. ◻ **Dünya malı** – fani sayılan bu dünyanın maddi nemətləri. [Vəzir:] *Əgər Abbas ilə Pərinin arasını vurdursan, səni dünya malından qəni eləyərəm.* (Nağıl). *İstəmərəm bu dünyanın malını; Qovğasını, fitnəsini, alını.* M.V.Vidadi.

3. *məc.* Müəyyən ictimai quruluş; mədəni və ictimai-tarixi əlamətlərinə görə birləşmiş insan cəmiyyəti, ictimai mühit. *Gərək tazə üsul üzrə açılsın cümlə məktəblər; Gətirmək tazə üslubə gərəkdir köhnə dünyanı.* S.Ə.Şirvani. *Yeni dünya quran insanlar hər şeydən qabaq namuslu, təmiz vicdanlı olmalıdırlar.* Ə.Vəliyev. // *məc.* Qayda, nizam, həyat quruluşu, həyat tərzi. [Əsgər:] *..Bu dünya belə gəlib belə getsə, bəs axırı nə olsun, onda işimiz necə olsun?* Ü.Hacıbəyov. [Həmzə] *belə bir səfərə çıxmaq üçün cahan müharibəsinin kəsilməsini, dünyanın düzəlməsini səbirsizliklə gözləyirdi.* Ə.Əbülhəsən.

4. *məc.* İnsanın müxtəlif şəkildə təzahür edən mənəvi aləmi, hissləri, təəssüratı, təsəvvürləri. *Gəncin əlini sıxarkən, elə bil, onun dünyası dəyişirdi.* M.S.Ordubadi. *Hər ürəyin öz dünyası bir səadət arzular; Qanlar ilə yazılmışdır hər azadlıq dastanı.* S.Vurğun. *Udub qızıl bayraq altda onun təmiz havasını; Ürəyimdə yaratmışam bəxtiyarlıq dünyasını.* S.Rüstəm. [Sarxan] *bir an üçün xatirələr dünyasına atıldı.* M.Hüseyn.

5. *məc.* Bütün insanlar, adamlar; el, xalq, camaat. *Dünya yığılsa da, dediyindən əl çəkməz. Qışqırıq səsinə dünya töküldü, gəldi. Bu nədir, dünyanı başına yığmısan! – Məftun kimidir kəndinə, dünyaları saymaz..* H.Cavid. // *məc.* İnsanların müəyyən fəaliyyət sahəsi, aləmi. *Elm dünyası. Tibb dünyası. Elm dünyasında yeni nə var? – Və lakin, bu arada çox az bir müddətin fasiləsində mətbuat dünyasında xeyli bir nəfəs genliyi əmələ gəldi.* C.Məmmədquluzadə. *İndi siyasət dünyası tufanlı bir dərya halını almaqdadır.* M.İbrahimov. // İnsanların ictimai peşə, sənət, məişət və s. cəhətdən götürülən ayrıca təbəqəsi, qrupu, zümrəsi. *Artistlər dünyası. Yazıçılar dünyası.*

6. Çoxlu miqdarda pul, mal, dövlət və s. (bu mənada bəzən cəm şəklində işlənir). *Əhməd baxıb gördü, heyvanlar bütün dünyanı gətiriblər. Heyvanlardan çox razılıq elədi.* (Nağıl). *Ol ki bir şişə şərabı ilə, dünyanı verib; Etiqadım budur, ol kəs genə məğbun eylər.* S.Ə.Şirvani. ◻ **Dünya(lar) qədər** – lap çox, son dərəcə çox, hədsiz. *Dünyalar qədər xoşbəxtdir. O, anasını dünyalar qədər sevir. – Aygün hələ soyunmamış toy paltarını; Hələ şaddır, bəxtiyardır dünyalar qədər.* S.Vurğun. **Dünyaya (dünyalara) dəyər** – çox qiymətli, dəyərli şey haqqında. *Gözəl olur bu yerlərin səhəri; Məncə, vardır dünyalara dəyəri.* A.Şaiq. // "Bir" sözü ilə: **bir dünya** – çoxlu, son dərəcə çox, külli, sonsuz. *Bir dünya yeni kitab almışam. Tamaşada bir dünya adam var idi. – Odur, şair oturmuş balaca miz dalında; Quş lələyi əlində, bir dünya xəyalında.* B.Vahabzadə.

7. **Dünyada, dünyasında** şəklində – qətiyyən, heç, heç vaxt, əsla. *Dünyasında belə şey ola bilməz. Dünyasında razı olmaz. Dünyasında elə adam deyil. – Dünyada yaltaqlıq nə olduğunu Mirzə bilməzdi.* Ə.Haqverdiyev.

8. **Dünya(lar)ca** şəklində – b a x **dünya(lar) qədər** (**dünya** 6-cı mənada). *Mənim tək bircə qardaşım var, dünyalarca istərəm*

*və əgər lazım olsa, onun yolunda özümü ölümə verərəm.* C.Məmmədquluzadə.

◊ **Dünya (bütün dünya) dağılsa (da)** – 1) heç bir şeyə baxmayaraq, mütləq. [Aslan bəy:] *Bütün dünya dağılsa da, dediyini edəcək, gələcəyəm söylədisə, ölsə, qalsa, gələcək.* C.Cabbarlı; 2) qətiyyən, heç bir vaxt, əsla. *Dünya dağılsa da, deməräm. – Bu dünya dağılsa da, sən qəlbimdəsən, ey şux; İlahəsən, dar gündə səni anmaq savabdır.* Şəhriyar. **Dünya (gen dünya) başına daralmaq (dar olmaq)** – böyük kədər, fəlakət üz vermək, son dərəcə pərişan olmaq, kədərlənmək. *Səni görən gözlər sənsiz dayanmaz; Gen dünya başına daralı, Sədəf!* Aşıq Bağban. *Belə olardısa, Rüstəmin başına dünya daralardı!* S.Rəhimov. **Dünya bir-birinə dəymək** – 1) qarışıqlıq düşmək, vəlvələ düşmək, çaxnaşma düşmək; 2) sarsılmaq, ağlını itirmək. *Əkbərin gözü qızın gözlərinə sataşanda dünya bir-birinə dəydi.* Mir Cəlal. **Dünya evi** *klas.* – ömür, insan həyatı mənasında. *Tapmadı, Vahid, hələ heç kəs bu xəttin sahibin: "Qaldı bu dünya evi divanədən-divanəyə".* Ə.Vahid. **Dünya əhli** – axirətə inanmayaraq bu dünyanın zövq və nemətlərindən istifadə edən adam. **Dünya görmək** – həyat təcrübəsi qazanmaq, təcrübələnmək. *O, dünya görmüşdür... Bilir yağılar; Boransız, süngüsüz məhv olan deyil.* S.Vurğun. *Qoca qartal dünya görüb.* İ.Əfəndiyev. **Dünya gözəli** – çox gözəl qız (qadın) haqqında; dilbər. *Dünya gözəli, qaçma bəşərdən.* S.Vurğun. [Fəxrəddin:] *Cahanbanu bəyim bunu mənə güzəştə gedərdi. Lakin bu dünya gözəlini qiymətdən düşürən onun şeytanlığıdır..* M.S.Ordubadi. **Dünya işığı görmək** – azadlığa çıxmaq, qapalı həyatdan azad olmaq. *Toy məclisindən savayı bir yer yoxdu ki, qızlar dünya işığını görə biləydi..* R.Əfəndiyev. **Dünya işığı görməmək** – azadlıqdan məhrum bir vəziyyətdə olmaq, qapalı həyat keçirmək. *Keçmişdə qadınlar dünya işığı görməzdilər.* **Dünya işığına həsrət qalmaq** – b a x **dünya işığı görməmək**. *Qadını dünya işığına həsrət qoyan çadra indi bizə arxaik bir şey kimi görünür..* M.İbrahimov. **Dünya kədəri** *ədəb.* – XVIII əsrin axırı və XIX əsrin əvvəlində Avropa ədəbiyyatında ifrat bədbinliyi və ümidsizliyi ifadə edən əhvali-ruhiyyə. **Dünya üzü** – b a x **dünya** 2-ci mənada. [Kərəm:] *Bu dünya üzündə üç şey zay olmaz; Biri yaxşılıq, biri elm, biri nan.* "Əsli və Kərəm". *Bir də görsəm göz açıb, gər ol güli-rəna üzün; Görmək istərsəm, gözüm çıxsın əgər dünya üzün.* S.Ə.Şirvani. **Dünyada durmaq** – yaşamaq, var olmaq, baqi qalmaq, əbədi qalmaq. *Mən gedərsəmsə, məramım yenə dünyada durar.* M.Ə.Sabir. **Dünyadan bixəbər** – heç bir şeydən xəbəri olmayan, qafil, cahil. *Bunlar, bu mürtəce ünsürlər Azərbaycan xalqını elmsiz, savadsız, dünyadan bixəbər, bir sözlə, müstəmləkə xalqları kimi qul halına salmaq istəyirdilər.* M.İbrahimov. **Dünyadan əl çəkmək** – dünya işlərindən uzaqlaşmaq, həyatda olan işlərlə, hadisələrlə daha maraqlanmamaq. *Sən dünyadan əl çəkib məhkum etdin özünü.* N.Rəfibəyli. **Dünyadan getmək** – b a x **dünyadan köçmək**. *Öldü eşqindən Nəsimi, iştə dünyadan gedir.* Nəsimi. *Yarat, sən köçəndə ellər söyləsin; Dünyadan nə gözəl bir insan gedir.* M.Rahim. **Dünyadan xəbərsiz** – b a x **dünyadan bixəbər**. [Xavərə] *elə gəldi ki, Kərimxanı, Xavəri və dünyadan xəbərsiz yatmış balaca Azadı gözaltı diqqətlə süzən qonağın qəlbi həsədlə, kinlə doludur.* M.İbrahimov. *Bir çox kəndlər qartal yuvası kimi sarp qayaların arasında dünyadan xəbərsiz yaşayırdılar.* S.Şamilov. **Dünyadan irtihal etmək** *kit.* – b a x **dünyadan köçmək**. **Dünyadan köçmək** – ölmək, vəfat etmək. *Dostunu anarkən elə bu zaman; Əsrimin qızı da köçmüş dünyadan.* M.Rahim. **Dünyanı almaq (tutmaq)** – hər yeri əhatə etmək, qaplamaq, hər yerə yayılmaq. *Sel dünyanı almışdır. İşıq dünyanı aldı. – Bir zaman zülm tutdu dünyanı; Ucalır xalqın ərşə əfğanı.* S.Ə.Şirvani. *Zəlzələ dünyanı tuta, bu çinarların halına təfavüt eləməz.* Mir Cəlal. **Dünyanı başına dar etmək** – son dərəcə kədərləndirmək, sarsıtmaq, çətin, çıxılmaz vəziyyətə salmaq. *Bu qiyam dünyanı xainlərin başına dar edəcəkdir.* M.İbrahimov. **Dünyanı başına götürmək** – bərk çığırmaq, bağırmaq, qışqırmaq, fəryad qoparmaq, səs-küy salmaq. **Dünyanı başına vurmaq (çal-**

**maq)** – sarsıtmaq, çox ağır təsir etmək, son dərəcə kədərləndirmək. *Elə san dünyanı çaldı başıma; Aman, ana, dur, gör ağlayan kimdir?* Aşıq Əmrah. **Dünyanın dərdi** – hamının qayğısı, hamının dərdi, fikri. [Süleyman Əsgərə:] *Balam, nə olub ki, belə qaradinməzcə oturubsan, yoxsa dünyanın dərdi sənə qalıbdır?* Ü.Hacıbəyov. **Dünyaya (dünyalara) sığmaz** yaxud **sığmayan** – son dərəcə məsud, xoşbəxt adam haqqında. *Genə dünyalara sığmaz, nə olubdur, Seyyid? Xoş baxıbdır üzünə, yoxsa genə yarı bu gün.* S.Ə.Şirvani. **Dünyaya əlvida demək (etmək)** *tənt.* – ölmək. **Dünyaya gələn** – doğulan, törəyən, meydana gələn, vücuda gələn. [Rizvan:] *Hər dünyaya gələn bir dəfə dünyadan gedəcək.* Ə.Haqverdiyev. **Dünyaya gəlmək** – doğulmaq, anadan olmaq, törəmək, vücuda gəlmək, meydana gəlmək. *Dünyayə gəlməyir nə səbəb bir vəfalı yar?* S.Ə.Şirvani. *Əziz balalar, nə yaxşı vaxtda siz dünyayə gəlmişsiniz.* N.Nərimanov. *Ey bu gün dünyaya gələn körpələr; Göz açın, yurdumuz nə tamaşadır!* S.Vurğun. **Dünyaya gəlmiş** – doğulmuş, anadan olmuş, törəmiş. *Biçarə qadın bu hadisədən sonra, yeni dünyaya gəlmiş qız nəvəsini götürüb .. qohumugilə köçür.* S.S.Axundov. **Dünyaya gətirmək** – törətmək, doğmaq, yaratmaq, vücuda gətirmək. *Biri məni bu dünyaya gətirmişdir məhəbbətlə; Öpüb-qucmuş, boyabaşa yetirmişdir məhəbbətlə.* S.Vurğun. **Dünyaya gözlərini yummaq** *tənt.* – ölmək. **Dünyaya səs salmaq** – dünyanın hər yerində eşidilmək, məşhur olmaq.

**DÜNYA-ALƏM** b a x **dünya** 2 və 5-ci mənalarda.

**DÜNYABAXIŞI, DÜNYAYA BAXIŞ** b a x **dünyagörüşü**. *Fəlsəfi dünyabaxışı.*

**DÜNYAGİR** *is.* [*ər.* dünya və *fars.* ...gir] *köhn.* Tamahkar, gözüdoymaz, xəsis.

**DÜNYAGÖRMÜŞ** *sif.* Həyat təcrübəsi çox olan, mübarizələrdən, çətinliklərdən, sınaqlardan çıxmış; təcrübəli, müdrik. *Kətxuda dünyagörmüş, ağıllı bir adam idi.* N.Nərimanov. [Səməd] *özü dünyagörmüş adam idi, hər şeydən başı çıxardı.* B.Talıblı. *Sayalı arvad kənddə dünyagörmüş ağbirçək sayılırdı.* Mir Cəlal.

**DÜNYAGÖRÜŞÜ** *is.* Həyat, təbiət və cəmiyyət haqqında görüşlər sistemi.

**DÜNYALIQ** *is.* 1. *köhn.* Çoxlu mal və dövlət. *Kişi öləndən sonra dünyalığı qalmışdı.*

2. Adətən "bir" sözü ilə: həddindən artıq, son dərəcə çox. *Bu, tamam bir dünyalıq işdir ki? – deyə Gəray özü də bilmədən addım-addım geri çəkildi.* S.Rəhimov.

**DÜNYAPƏRƏST** *sif.* [*ər.* dünya və *fars.* ...pərəst] *klas.* Dünyanın zövq və nemətlərinə aludə olmuş. *Zövqsüz lazım çıxar dünyadan ol dünyapərəst; Kim, ona dünyadan ancaq zövqi-dünyadır qərəz.* Füzuli.

**DÜNYAPƏRƏSTLİK** *is.* Dünyapərəst adamın keyfiyyəti; dünyanın zövq və səfalarına aludəlik.

**DÜNYƏVİ** *sif.* [*ər.*] Dünyaya aid olan, dünya ilə bağlı olan; din ilə əlaqəsi olmayan, dini mahiyyətdə olmayan. *Dünyəvi məktəblər. Dünyəvi adam. Dünyəvi elmlər. Zakirin qoşma və gəraylıları dərin dünyəvi mahiyyət daşıyır.*

**DÜNYƏVİLİK** *is.* Dünyaya aid olma, dünya ilə bağlı olma; dini olmama, dinlə əlaqəsi olmama.

**DÜPBƏDÜZ, DÜPPƏDÜZ** b a x **dümdüz**.

**DÜRCƏK** *is.* Dəri, ya qumaş üzərində çıxıntılar, qabarıqlar, habelə onlardan hər biri.

**DÜRDANƏ** *is.* [*ər.* dürr və *fars.* danə] 1. İnci (mirvari) dənəsi; inci, mirvari. // Klassik şeirdə: gözəlin dişlərinə işarə. *Güləndə dişlərin ağzında, ey can; Sədəf içindəki dürdanəmizdir.* Xətayi. *Ağzın sədəf, dişlərindir dürdanə; Əcayib cəvahir, ləli sevmişəm.* M.P.Vaqif.

2. *məc.* Çox əziz, sevgili, istəkli övlad mənasında. *Balamsan, bir danəsən; Sədəfsən, dürdanəsən; Mən ölsəm sənə qurban; Sən ölmə, bir danəsən.* (Bayatı).

3. *məc.* B a x **dürr**. *Canlar tazələnir güftguyindən; Sözünün hər biri dürdanə gərək.* Q.Zakir. *Sən naz ilə gül ki, sədəfin qiyməti artsın; Göz yaşı kimi incisi, dürdanəsi məndən.* Ə.Vahid.

**DÜRDANƏLƏNMƏK** *f.* İnci kimi düzülmək. *Bir şirin güftarlı, bir şəkər sözlü; Ağzı sədəf, dişi dürdanələnmiş.* M.P.Vaqif.

**DÜR-DÜYÜN** *is.* Lazım olan xırda-xuruş şeylər.

**DÜR-DÜYÜNÇƏ** *is.* Düyünçə şəklində bağlanmış şeylər. *Sonra* [Ələmdar] *..gizlətdiyi qızıl dür-düyünçələrini dartışdırıb dəyirmi stolun üstünə tökdü, əsgi-üsgüdən azad etdi.* S.Rəhimov.

**DÜRƏFŞAN** *sif.* [*ər.* dürr və *fars.* ...əfşan] *klas. şair.* Dürr saçan, inci saçan. *Ey eşqi-dürəfşanım, vey bülbüli-bustanım; Vey nərgisi-məstanım, didarına müştaqəm.* Nəsimi. *Payibənd oldum səri-zülfi-pərişanın görüb; Nitqdən düşdüm, ləbi-ləli-dürəfşanın görüb.* Füzuli.

**DÜRƏK** *sif.* [*fars.*] Müxtəlif cinslərdən əmələ gəlmiş; mələz, qarışıq. *Dürək toyuq.*

**DÜRƏNG** *sif.* [*fars.*] *köhn.* 1. İki cür rəngi olan; ikirəngli.

2. *məc.* İkiüzlü, riyakar. *Dürəng adam.*

**DÜRƏNGLİK** *is. köhn.* 1. İki rənglik.

2. *məc.* İkiüzlülük, riyakarlıq. *Dürənglik bizə nisbət xəta deyil də, nədir?* M.Ə.Sabir.

**DÜRGƏ** *is.* Dəstə, yığın, toplu; yığılıb (sarınıb) bağlanmış şey. *Bir dürgə pul.*

**DÜRGƏLƏMƏ** "Dürgələmək"dən *f.is.*

**DÜRGƏLƏMƏK** *f.* Dürgə halına salmaq. *Pulu dürgələmək.*

**DÜRGƏLƏNMİŞ** *f.is.* Dürgə halına salınmış.

**DÜRGƏLƏTMƏK** *icb.* Dürgə halına saldırmaq.

**DÜRGƏLİ** *sif.* Dürgələnmiş halda olan. *Dürgəli kağız.*

**DÜRLÜ** *is.* 1. Cür, növ. *Maşının keçdiyi yerlərdə, onun arxasınca, uçurulan evlərin yerində yeni binalar, başqa dürlü küçələr, meydançalar tikilir.* S.Hüseyn. [Bəhram:] *Yox, mənim ürəyimdə başqa dürlü hisslər oyanır və get-gedə qüvvətlənir.* C.Cabbarlı. ☐ **Bir dürlü** (inkar feillərlə işlənir) – bir növ, bir qədər, heç də, heç cür. *Buna bir dürlü yaxışmaz, belə, saqqal deyəməm; İki yüz rəngə çalır; sürx, qara, al deyəməm.* Ə.Nəzmi. *Xalidə bir saat əvvəl yuxudan oyanmışdı. Ağlamaqdan həlak olurdu. Şərifə bir dürlü onu sakit edə bilməyirdi.* S.Hüseyn. *Sazını torbadan çıxardanda belə, gözünü şairdən çəkmir, maraqla onu dinləmək istəyən bu adamı bir dürlü anlaya bilmirdi.* M.Hüseyn. **Min dürlü** – çox müxtəlif, min cür, çoxlu. *Qoy qonşular alsın hələ min dürlü fəvaid.* M.Ə.Sabir. *Min dürlü fayidə yetirərdin camaatə.* A.Səhhət. **Heç bir dürlü** – qətiyyən, əsla, heç cür. **Hər dürlü** – hər cür, müxtəlif. *Ey milləti cəhalətə vadar edən axund; Hər dürlü fəqrü iczə giriftar edən axund.* Ə.Qəmküsar. *Əyilməm bir daha .. bir həvəs məni; Hər dürlü matəmdən, qəmdən uçurdu; Xəstə xatirimdə bir həyat qurdu.* S.Vurğun.

2. Cürbəcür, çoxlu, növbənöv. *..Baxmazlar sənin sinəndə dürlü gühərin var.* M.Ə.Sabir. *Yaxşılığa yaxşı cəzalar olar; Pisliyə həm dürlü cəzalar olar*. A.Səhhət.

**DÜRLÜ-DÜRLÜ** *sif.* Cürbəcür, növbənöv, hər cür, hər növ, müxtəlif. *Dürlü-dürlü yeməklər. – Cəmalından sənin hər gecə, ey şah; Düşər yüz min ziyalar dürlü-dürlü.* Xətayi. *Fələk saldı dürlü-dürlü odlara; Şan-şan olmuş, parələnmiş könlümü.* M.V.Vidadi.

**DÜRMƏK** *is.* 1. Bükülmüş, dürmələnmiş şey; bağlama.

2. İçinə yağ, pendir və s. qoyulub (və ya bunlarsız) lülə şəklində bükülmüş lavaş, yuxa. *Yuxanın arasına pendir qoyub dürmək düzəltmək. Yağ dürməyi. Pendir dürməyi. – İt yuxa yemək bilər, dürmək tutmaq bilməz.* (Ata. sözü). *Bir neçəsi kənarda oturub çörək dürməyi yeyir.* C.Məmmədquluzadə. *Səkinə həyətin ortasında* [*Mayanı*] *saxladı, arasına yumurta və yağ bükdüyü dürməyi meşin heybənin küncünə qoydu.* M.İbrahimov. *Kimisi yaxmac qayırır, .. kimisi yağla şorun qatışığından dürmək eləyib Qəmərin stəkanının yanına qoyurdu.* Ə.Vəliyev.

3. Əllə xörək yeyəndə birdəfədə ağıza qoyulan xörək. *Bir-iki dürmək yedi, dayandı.* ☐ **Dürmək vurmaq** – əllə xörəyi dürməkləyib yemək. *Xörəyə dürmək vurmaq.*

**DÜRMƏKLƏMƏ** "Dürməkləmək"dən *f.is.*

**DÜRMƏKLƏMƏK** *f.* 1. İçinə pendir, yağ və s. qoyub dürmək halına salmaq (lavaşı, yuxanı); dürmək qayırmaq; yığıb yumrulamaq. *Yuxanı dürməkləyib yedi. – Sadıqzadə bıçağı ağ şanın yanından çəkdi, onun bir parçasını götürüb təndirdə bişmiş ağ lavaşın üstünə qoyub dürməklədi, iştaha ilə yeməyə başladı.* S.Rəhimov. *Əbil pendirlə qıjını lavaşın arasına qoyub dürməklədi və çox iştaha ilə yedi*. Ə.Vəliyev.

2. Paltarın ətəyini büküb belə ilişdirmək.

**DÜRMƏNC** *is. dan.* b a x **dürmək** 1-ci mənada. [Araz:] *Doktor, istini soyuğa, soyuğu istiyə qatıb dürmənc kimi yeyən bir fəhləyəm.* A.Şaiq.

**DÜRR** *is.* [*ər.*] 1. İnci, mirvari. // *məc.* Şairanə təşbehlərdə gözəlin dişlərinə işarə. *Ləli-ləbi bənzər gövhər kanına; Düzülüb gövhərtək dür dəhanına.* M.V.Vidadi**.** *Səmən iyli, səhabi zülf, ay qabaq; Qönçə dəhan, dür diş, ərğəvan dodaq.* M.P.Vaqif. *Sədəf dəhanında sərasər dişi; Dürri-bihəmtadır mədən içində.* Q.Zakir.

2. *məc.* Saf və təmiz şey mənasında (ümumiyyətlə, saflıq, təmizlik rəmzi kimi işlənir). *...İnsan* [Zərqələmə] *baxarkən, qədim şairlərin dediyi kimi, palçığa düşmüş bir dürr və ya gövhər gördüyünü zənn edirdi.* Ə.Sadıq. □ **Dürr kimi** *məc.* – bərraq, parlaq şey haqqında. *Bitir çəməndə lalələr, əlində al piyalələr; Səhər zamanı dürr kimi, düşər ot üstə jalələr.* A.Səhhət.

◊ **Ağzından dürr tökmək (tökülmək)** – çox gözəl mənalı və rəvan danışmaq, gözəl və dəyərli sözlər söyləmək (bəzən təmtəraqla, lakin məzmunsuz danışmaq mənasında istehza məqamında işlənir). *Yeriyəndə kətan köynək dizindən; Danışanda dürr tökülür sözündən.* "Əsli və Kərəm". *Ağzından dürr tökür zalımın qızı; Bizdən yaxşı bilir dolanmamızı.* S.Vurğun. [Tahir:] *Kişinin oğlu danışanda ağzından dürr tökülür.* M.Hüseyn.

**DÜRTƏLƏMƏK** b a x **dürtmək**.

**DÜRTMƏ** 1. "Dürtmək"dən *f.is.*

2. *is.* Əlini yumruq halına gətirərək barmaqlarının qatlanmış yeri ilə vurma. *Onun qoluna bir dürtmə vurdu. – Arvad onun ürəyinə bir dürtmə vurdu.* Mir Cəlal. *Ərknazın gözləri yerə dikildi. Əlyarov ona yavaşcadan dürtmə vurdu.* M.Hüseyn. // Ümumiyyətlə, bir şeyin ucu ilə vurmaq, itələmək. *Buzovlar analarının yelininə burunları ilə dürtmə vura-vura əmirdilər. – Şaban arvadını, uşağını görən tək qollarını açıb istədi balasını bağrına bassın, amma soldat mane olub daldan bir tüfəng dürtməsi vurdu.* Ə.Haqverdiyev.

**DÜRTMƏK** *f.* 1. Zorla soxmaq (salmaq, keçirmək, yerləşdirmək). *Pası mırıldana-mırıldana əyildi, açılmış kağızı qatlayıb onun qoynuna dürtdü.* S.Rəhimov. *Ağazal ayağını birtəhər lak çəkməsinə dürtməyə çalışırdı*. Ə.Əbülhəsən. □ **Özünü dürtmək** – özünü zorla soxmaq. *Göstərməsin Allah o günü kim, gecə-gündüz; Dürtərdi özün hər yerə, hər yanə pristav.* Ə.Qəmküsar.

2. B a x **dürtmələmək**.

**DÜRTMƏKLƏMƏ** "Dürtməkləmək"dən *f.is.*

**DÜRTMƏKLƏMƏK** b a x **dürtmələmək**.

**DÜRTMƏKLƏNMƏ** "Dürtməklənmək"dən *f.is.*

**DÜRTMƏKLƏNMƏK** *məch*. Dürtməklə vurulmaq.

**DÜRTMƏLƏMƏ** "Dürtmələmək"dən *f.is.*

**DÜRTMƏLƏMƏK** *f.* Dürtməklə vurmaq. *Birdən molla məni öz adımla çağırdı. Yanımdakı şagirdlər məni dürtmələdilər.* T.Ş.Simurq. *Bu dəmdə* [Süleyman bəyi] *kimsə dürtmələyib ayıltdı*. B.Talıblı. [Tapdıq] *bir şey çıxmadığını görüncə özünü anasının böyrünə verdi. Onu dürtmələməyə başladı*. Ə.Vəliyev.

**DÜRTMƏLƏNMƏ** "Dürtmələnmək"dən *f.is.*

**DÜRTMƏLƏNMƏK** *məch*. Dürtməklə vurulmaq.

**DÜRTÜLMƏ** "Dürtülmək"dən *f.is.*

**DÜRTÜLMƏK** *f.* Özünü zorla soxmaq, zorla soxulmaq (bir yerə). *Asta qaçıb dürtülərik xəlvətə; Kim nə deyər bizdə olan qeyrətə?* M.Ə.Sabir. *Qabaq səflər bizim top, pulemyot və silah atəşindən seyrəldisə də, daldakılar buna baxmayaraq, irəli dürtülməyə çalışırdılar.* Ə.Əbülhəsən.

**DÜRTÜNMƏK** b a x **dürtülmək**.

**DÜRTÜŞDÜRMƏ** "Dürtüşdürmək"dən *f.is.*

**DÜRTÜŞDÜRMƏK** *f.* 1. Zorla soxmaq, bir şeyi güclə cibə və s.-yə yerləşdirmək.

2. B a x **dartışdırmaq**.

**DÜRTÜŞDÜRÜLMƏ** "Dürtüşdürülmək"dən *f.is.*

**DÜRTÜŞDÜRÜLMƏK** *məch*. Zorla soxulmaq, zorla cibinə və s.-yə yerləşdirilmək.

**DÜRTÜŞMƏ** "Dürtüşmək"dən *f.is.*

**DÜRTÜŞMƏK** *f.* Dürtülmək (çoxları haqqında).

**DÜRÜST** *sif.* [*fars.*] 1. Doğru, düzgün, düz. *Dürüst söz. – Avazı idi bəsi mülayim;*

*Üslubi dürüst, üsuli qani.* Füzuli. // Həqiqi, gerçək, doğru, sadiq. *Deyərlər, dərdi-eşqin adəm öldürməz, dürüstdür bu..* X.Natəvan. // Düz, doğruçu, vicdanı təmiz. [Hacı Qara:] *Mən sizin tamam hiylələrinizdən xəbərdaram, əgər siz dürüst adam olsaydınız, bu gecə vaxtı bu yolda görünməzdiniz.* M.F.Axundzadə. *Bu Kərbəlayı yaxşı kişidir, Allah bəndəsi, doğru, dürüst adamdır.* Ə.Haqverdiyev.

2. *Zərf mənasında.* Yaxşı, lazımi qaydada, lazımi kimi, düzgün, dəqiq; diqqətlə, yaxşı-yaxşı. *Hacı Əbdüləzim dürüst qulaq verəndən sonra dedi: – Kişi, məgər sən öz qızının düşmənisən?* Ə.Haqverdiyev. *Seyid, Tahirzadənin adını, yaşını, peşəsini soruşub dürüst yazdı.* Mir Cəlal. // Lazımınca, lazımi qədər, yaxşı. [Hacı Rəcəbəli:] *Qəribə sual edirsən, Ata Mərdan! Bəs məlum ki, məni hələ dürüst tanımırsan.* M.F.Axundzadə. *Qədir bunları dürüst öyrənib yadda saxlamasa da, mətləbi başa düşürdü.* Mir Cəlal. ☐ **Dürüst etmək (eləmək)** – saz eləmək, saz hala salmaq, düzəltmək. [Hacı Kərim:] *Məsələn, bir zad dürüst edibdir ki, adına iksir deyirlər.* M.F.Axundzadə. *Bir qədər mən sənə gətirdim pul; Ki, sınan sazını dürüst eylə.* S.Ə.Şirvani.

**DÜRÜSTLƏŞDİRİLMƏ** "Dürüstləşdirilmək"dən *f.is.*

**DÜRÜSTLƏŞDİRİLMƏK** *məch.* Dürüst hala salınmaq, dəqiq şəklə salınmaq; dəqiqləşdirilmək. *Dərsliyin IV və V fəsillərinin xronoloji çərçivəsi dürüstləşdirilmişdir.* (Qəzetlərdən).

**DÜRÜSTLƏŞDİRMƏ** "Dürüstləşdirmək"dən *f.is.*

**DÜRÜSTLƏŞDİRMƏK** *f.* Dürüst hala salmaq; dəqiqləşdirmək. [Sabit Mirzə] .. *zənnində yanılıb-yanılmadığını dürüstləşdirmək üçün diqqətlə Dadaşovun üzünə baxdı.* İ.Məlikzadə.

**DÜRÜSTLÜK** *is.* Düzlük, doğruluq, düzgünlük; dəqiqlik. // Həqiqilik, gerçəklik, səhihlik.

**DÜRÜYƏ** *is.* [*fars.*] *köhn.* Dəri ya mahuddan tikilən dəyirmi təpəli papaq.

**DÜSƏR** *is.* [*fars.*] 1. Bir tərəfi balta, o biri tərəfi külüng olan alət. *Düsərlə həm yer qazılır, həm də ağac yarılır.*

2. İkiuclu mıx. *Bu taxtaya düsər vurmuşlar.*

**DÜSTUR** *is.* [*ər.*] 1. Qanun, qayda, əsas, üsul. *Həmən bu düsturu öyrənib də sən; Ər oğlu ər kimi tab et bəlaya.* S.Vurğun. *Bəs xalqla yazıçı arasında mənəvi rabitə necə yaranır? Bu barədə düstur vermək çətindir.* M.İbrahimov.

2. Hər cür kəmiyyətlərin, tərkiblərin, ünsürlərin və s.-nin məcmusunun (rəqəmlərlə, hərflərlə, xüsusi işarələrlə) şərti ifadəsi; formul. *Riyazi düstur. Həndəsi düstur.*

**DÜSTURÜLƏMƏL** *is.* [*ər.*] *köhn.* Təlimat, göstəriş, qayda, nizam. [Əsəd bəy:] *Bu hərəkətdə bitərəf qalmaq barəsində* [bizə] *düsturüləməl göndərmişlər, – dedi.* M.S.Ordubadi.

**DÜŞAXƏ** *is.* [*fars.*] *tar.* Qədim zamanlarda ölümə məhkum edilmiş adamlar üçün cəza aləti (bu alət haçalanmış ağacdan ibarət olub, cinayətkarın boynu və əlləri onun yarığına keçirilərək bərk sıxılardı). *Əlbahili Dərbənd şəhərinə yetişdi, .. İbni-Nəcmi tutub məhbus* [etdi] *və ayaqlarına kündə və boynuna düşaxə vurub xəlifə hüzuruna göndərdi.* "Dərbəndnamə".

**DÜŞBƏRƏ** *is.* Nazik yayılıb doğranmış xırda xəmir parçalarının içinə ət qoyulub bükülərək suda bişirilən xörək.

**DÜŞBƏRƏXANA** *is.* Düşbərə bişirilib satılan yer, aşxana.

**DÜŞBƏRƏXOR** *is.* [düşbərə və *fars.* ...xor] Düşbərə qabı; içinə qaşıqxörəyi tökülən qab. *Ləməyə bəzən çini gülabzən, böyük, görkəmli, dayaz düşbərəxor* (*supnik*) *düzülərdi.* H.Sarabski.

**DÜŞBƏRƏLİK** *sif.* Düşbərəyə yarar. *Düşbərəlik ət.*

**DÜŞDÜRMƏ** "Düşdürmək"dən *f.is.*

**DÜŞDÜRMƏK** *icb.* Düşməyə məcbur etmək.

**DÜŞƏLGƏ** bax **düşərgə**[1]. ..*İkimci düşəlgədə, gecə Mələk itdi* (*qaib oldu*). *Bir aydan sonra əmisi oğluna qoşulub qaçması xalq arasında söyləndi.* A.Divanbəyoğlu.

**DÜŞƏNBƏ** *is.* [*fars.*] Həftənin birinci günü, bazar ertəsi.

**DÜŞƏRGAH** bax **düşərgə**[1] 1 və 2-ci mənalarda.

**DÜŞƏRGƏ**[1] *is.* 1. Müvəqqəti yaşayış yeri, müvəqqəti yurd, mənzil. *Turist düşərgəsi.*

// Köçün, karvanın və s.-nin istirahət üçün mənzil saldığı yer; duracaq, dayanacaq. *Kürün sahili köçərilərin düşərgəsinə çevrilmişdi.* İ.Şıxlı.

2. Kənddən uzaq əkin sahələrində adamların istirahət və yemək üçün toplandığı yer. *Şamaxıdan gələn biçinçilər çölün ortasında, taxıl zəmilərinin kənarında düşərgə saldılar.* İ.Şıxlı.

3. Qoşun hissələrinin məskun məntəqədən kənarda, açıq havada müvəqqəti mənzil saldığı yer; lager. *Hərbi düşərgə. Əsgər düşərgəsi.*

4. Məhbusların, hərbi əsirlərin saxlandığı yer; lager. *Əmək-islah düşərgəsi. Alman-faşistlərinin dəhşətli ölüm düşərgələri. – Ulduzlar yəqin görür gecənin bu çağında; Uzaq Makranizosda qanlı düşərgələri..* Ə.Cəmil.

**DÜŞƏRGƏ²** *is. məh. etnoqr*. Keçmiş toylarda: bəyin hamam boğçasını gətirən adama verilən hədiyyə, şey. *Bəy xonçası gətirənə, .. adət belədir, gərək düşərgə versinlər.* R.Əfəndiyev.

**DÜŞƏRİNƏ** *zərf* Necə gəldi, necə oldu, qarasına, düşünmədən.

**DÜŞƏRLİ** *sif.* Düşən, xeyirli, faydalı, yaxşı təsiri olan. *Bunlara* [ara həkimlərinə] *müraciət edənlər zənn edirlər ki, bunlarda "sirli", "düşərli" dərmanlar vardır*. İ.Əfəndiyev.

**DÜŞHADÜŞ** 1. *is.* Düşmək işi, kütləvi surətdə, dalbadal düşmə. *Düşhadüş başlandı.*

2. *zərf* Yerlik halda – düşən zaman, düşərkən, düşməyə başlarkən. *Kapitan kəndiri yerə atanda Tahir onu düşhadüşdə tuta bildi.* M.Hüseyn.

**DÜŞKÜN** *sif.* 1. Xoşbəxtliyini, rifahını itirmiş, yazıq, bədbəxt, zavallı. *Düşkün halın sitəmkara deməyin; Yalvarıbən varə-varə deməyin.* Aşıq Həsən. *Olmasaydı əgər bu üç xoş gün; Mənim ömrüm olurdu pək düşkün.* A.Səhhət. // Ruhdan düşmüş, naümid, məyus, kədərli. *Anar o dəmləri mən şimdi müztərib, düşkün; Kəmali-yəslə tiflanə ahüzar edərəm*. H.Cavid. *Doğrudan da qız çox düşkün və kədərli idi.* M.İbrahimov.

2. Zəif, cansız, əldən düşmüş, üzgün, xəstə. *Tərlanım, tərlanım, gözəl tərlanım; Sənə qurban olsun bu düşkün canım.* S.Vurğun. // Qoca, ahıl.

3. *is.* Mübtəla, düçar. *Qadın düşkünü. Şəhvət düşkünü. Qumar düşkünü. – Sinfə girdiyi zaman içki düşkünü olan Nikolay Petroviçi spirt qoxusu tamamilə sərxoş etdi.* A.Şaiq. // Bir şeyin hərisi olan, həddən artıq bir şeyin aludəsi olan. *Rəyasət düşkünü. Böyük vəzifə düşkünü.* // Vurğun, aşiq. *Nə olur danmaqdan, daldalanmaqdan; Düşkününəm aləm-aşikar sənin.* Q.Zakir. *Səhər-səhər durub qıya baxanda; Düşkünüyəm mən o ala gözlərin.* Aşıq Məhəmməd. *Əkbər elm adamı, kitab düşkünü də deyildi.* Mir Cəlal.

4. Mənən düşmüş, rəzil, alçaq. *Cahangir ağa zəif iradəli, naqis ağıllı, düşkün fikirli bir adam idİ.* Ə.Vəliyev.

5. Yoxsullaşmış, kasıblaşmış, yoxsul, kasıb. // Yazıq, fəqir, binəva. // İs. mənasında. [Kərəm:] *Kərəm eylə, bircə yapış əlimdən; Yetir muradına sən də düşkünü!* "Əsli və Kərəm".

**DÜŞKÜNLƏŞMƏ** "Düşkünləşmək"dən *f.is.*

**DÜŞKÜNLƏŞMƏK** *f.* 1. Düşkün hala gəlmək, düşmək, zəifləmək, əldən düşmək, qocalmaq.

2. Öyrəşmək, mübtəla olmaq, aludə olmaq, bir şeyin düşkünü olmaq.

3. Fəqirləşmək, yoxsullaşmaq, kasıblaşmaq.

**DÜŞKÜNLƏŞMİŞ** *f.sif.* Düşkün hala gəlmiş.

**DÜŞKÜNLÜK** 1. Düşkün hal, tənəzzül, durğunluq.

2. Bir şeyə aludə olmuş adamın halı; mübtəlalıq, aludəlik. *İçki düşkünlüyü.*

**DÜŞMƏ** 1. "Düşmək"dən *f.is.* [Qədir] *ağaların, yüzbaşıların taxtdan düşməsini təsəvvür edə bilmirdi.* Mir Cəlal.

2. *sif.* Təsadüfi, gözlənilməyən, təsadüfən ələ keçən. *Düşmə iş. Düşmə şey.*

**DÜŞMƏK** *f.* 1. Öz ağırlığının təsiri ilə yerə enmək, yuxarıdan aşağıya enmək, tökülmək. *Göydən üç alma düşdü...* (nağılların sonu). *Paraşütlə düşmə. Qayadan dərəyə iri daşlar düşürdü. – Bu zaman bir bomba düşür uzağa; Dalğa vurub onu sərir torpağa.* M.Rahim. *Qatır hürkdü. Kiminsə tərkindən xurcun düşdü.* Mir Cəlal. // Yuxarıdan enib bir şeyin üzərində dayanmaq. *Şəfqət bacısının*

*gözlərindən axıb sifəti aşağı yuvarlanan yaş damcılarının birisi Xasayın üzünə düşdü.* Ə.Vəliyev. // Oturduğu, durduğu, ya çıxdığı yerdən aşağıya enmək. *Ağacdan düşmək. Pilləkəndən düşmək. Damdan düşmək.* – [Salamov Baxşıya:] *Daha bu vəzzariyyatı kimə oxuyursan? Düş aşağa, düş, danışma!* C.Cabbarlı. // Dərin bir şeyin dibinə enmək. *Dalğıc dənizin dibinə düşdü. Quyuya düşmək.*

2. Heyvan və ya başqa bir minikdən yerə enmək. *Atdan düşmək. Arabadan düşmək. Avtobusdan düşmək.* – *..Onlar şeylərini götürüb qatardan düşdülər.* S.Rəhimov. *Maşın adamlardan bir az aralı duranda Kələntər saymazyana düşüb yaxınlaşdı.* M.İbrahimov. *Fəhlələr qayıqdan düşüb buruğa qalxdılar.* M.Hüseyn.

3. Ayaq üstə dayana bilməyərək yıxılmaq. *Qadın özündən gedib yumşaq divanın üzərinə düşdü.* M.S.Ordubadi. *İstidə tərlədim; Soyuqda üşüdüm; Yürüdüm düşdüm; Qalxdım, yenə düşdüm.* R.Rza. // *məc.* Yıxılmaq (bu mənada adətən tərkib halında işlənir). ◻ **Ayağına düşmək** (b a x **ayaq**[1]). – *Nəbini görən kəndli Nəbinin ayağına düşüb müsibəti söyləyir.* "Qaçaq Nəbi". *Gül camalın görüb düşsün torpağa; Bülbülü götürüb əfğana gəlsin.* Q.Zakir. *Yetməz əlim, nə çarə düşəm xaki-payüvə; Bir-bir deyəm sənə ələmü dərdü möhnətim.* S.Ə.Şirvani. // Sərilmək, uzanıb qalmaq, sərələnmək, uzanmaq. *Sərvi-qəddin düşübdü xak üzrə..* X.Natəvan. // Bu və ya başqa bir tərzdə yıxılmaq, yıxılıb qalmaq. *Üz üstə düşmək. Böyrü üstə düşmək.* – [Ağca xanım] *üzü üstə döşəməyə düşüb hönkür-hönkür ağladı.* Mir Cəlal.

4. Özünü bir şeyin üstünə salmaq, yıxmaq, yaxud bir şeyin üstünə əyilmək. *Həcər Mehdinin cənazəsi üstünə düşüb, göz yaşlarını bahar buludu kimi axıdır.* "Qaçaq Nəbi".

5. Sallanmaq, tökülmək. *Soltanüşşüəra .. toplanıb dalına düşən qara zülflərinə, .. bütün surət və simalarına tamaşa edirdi.* M.S.Ordubadi. *..Sona da indi dönüb bayaqkı yerində dayanmış, başından siyrilib çiyninə düşən ağ torunun ipək saçaqları ilə oynayırdı.* Ə.Əbülhəsən. // Çox boş olduğu üçün yerində durmayıb aşağı sürüşmək, enmək, tökülmək. *Paltar əynimdən düşür. Örpəyi başından düşdü.* – *Şirəli başını ovuşdurdu. Şalvarı düşürdü.* M.Hüseyn.

6. Öz-özünə tökülmək, yerindən çıxıb (qopub) düşmək. *Dişi düşmək. Dırnağı düşmək. Divarın bir kərpici düşdü. Stolun bir qıçı düşdü.* – *Dişi düşmüş boz öküz qoşulub cöngələrə.* (Ata. sözü).

7. Bir yerə gələrək orada müvəqqəti yerləşmək, qalmaq, müsafir olmaq, qonaq olmaq. *Türkiyədə harada düşmüşdün? Mehmanxanaya düşmək. Qonaqlar bizə düşmüşlər.* – *Onlar bu gün düşmüşlər çay üstə; Yırtıq alaçıqda gecələyirlər.* A.Səhhət. *Bir də pristav və naçalnik gələndə Əminin evinə düşərdilər.* N.Nərimanov. *"Pirçinar"ın yaxınlığında, qonşuların birisi ilə tanış bir kəndlinin evinə düşəcəkdik.* S.Hüseyn.

8. Yağmaq. *Bu il bu yerlərə heç yağış düşmədi.* – *Dağlara qar düşübdü; Üstündən tar düşübdü; Gedərəm, dayanmaram; Yadıma yar düşübdü.* (Bayatı). *Mərəndə təzəcə qar düşmüşdü.* M.İbrahimov. // Qonmaq, çökmək, örtmək. *Otların üzərinə şeh düşübdür. Bərk duman düşmüşdü, heç şey görünmürdü.*

9. Yönələrək bir yerə, ya bir şeyin üzərinə yayılmaq, enmək, saçmaq, gəlmək. *İşıq düşmək. Kölgə düşmək. Ağacların arasından ayın işığı düşür.* – *Əziz balalar! ..İndi otağın havasında nə olacağını bilmək istəyirsinizsə, gün pəncərədən otağa düşəndə onun* [şəfəqinə] *diqqət ediniz.* N.Nərimanov. *Yenicə çırtlayan günəşin ilk şüaları onların üstünə düşmüşdü.* Ə.Məmmədxanlı. *Görün, bağa-eyvana sərin kölgə düşəndə; O qız yenə oxuyub şən mahnılar çalırmı?* Ə.Cəmil.

10. Paylaşdırma, təyinat nəticəsində bu və ya başqa bir yerə təyin edilmək, göndərilmək. *İnstitutu bitirmiş həkimlərin ikisi Qazaxıstana, üçü Orta Asiya Respublikalarına düşdü.* – *Sinifdə dərs briqadaları bölünəndə Rübabə Gəldiyevin briqadasına düşdü.* Mir Cəlal. // Bir yerə daxil ola bilmək, yaxud özünü yetirə bilmək, özünü sala bilmək; iştirak edə bilmək, bir yerdə olmağa imkan tapa bilmək. *Təntənəli iclasa düşə bilmədim. Yeni tamaşaya güclə düşdüm. O, bu il ali məktəbə düşə bilmədi. Müdirin qəbuluna düşdüm.*

11. Təsadüfi, ya qeyri-təsadüfi bir şeyin içində olmaq, özünü bir şeyin içində görmək. *Tora düşmək. Tələyə düşmək. Həbsə düşmək. – Bəndü zindani-qəmü möhnətdən olmuşdum xilas; Ah, kim düşdüm yenə, zülfü zənəxdanın görüb.* Füzuli. *Axırda Naməlsəm məhəlləsindən bir neçə adam qazamata düşdü.* N.Nərimanov. *Tələyə də bir zorba siçovul çoxdan düşüb gəbərmişdi.* H.Sarabski. // Keçmək, çıxmaq, daxil olmaq. *..Ayaqlarım yalın olduğuna görə, yolun kəsəkləri məni incitdi və mən də üst tərəfdə tapdanmamış bir cığıra düşdüm.* A.Divanbəyoğlu.

12. Başlamaq, yetişmək, gəlib çatmaq. *Soyuqlar düşdü. İstilər düşdü. Sərinlər düşdü. Qış düşdü.* ☐ **Axşam (qaranlıq) düşmək** – hava qaralmaq, qaralmağa başlamaq. *..Axşam düşdü, yerə qaranlıq çökdü.* A.Divanbəyoğlu. *Elə qaranlıq düşmüşdü ki, göz gözü görmürdü. Çomağı götürüb yerimdən sıçradım.* A.Şaiq. *Axşam qaranlığı düşəndə qoyunun sallanaraq çöldən qayıtması ürəyini açan unudulmaz bir mənzərə oldu.* M.İbrahimov.

13. Baş vermək, başlamaq, qopmaq. *Dava düşmək. Qarışıqlıq düşmək. Qaçhaqaç düşdü. Səs-küy düşmək. Çaxnaşma düşmək. – Bir neçə vaxt kəndə böyük nizamsızlıq düşmüşdü.* N.Nərimanov. *Uzun mübahisə və deyişmə düşdü.* Mir Cəlal. *Deyəsən, yenə gəlhagəl düşdü..* S.Rəhman. *Səmada, torpaqda düşür qırhaqır; Yerdən alov yağır, göydən od yağır.* M.Rahim. // Baş verib yayılmaq. *Azar düşmək. – Bir müsəlman kəndinə, müsəlman məhəlləsinə çiçək kimi müalicəsi asan bir uşaq naxoşluğu düşəndə yazıq uşaqlar bir-bir başlayırdılar qırılmağa.* C.Məmmədquluzadə. [Üçüncü kəndli:] *Bir üç il bundan irəli kəndə "xalyar" naxoşluğu düşmüş idi.* Ə.Haqverdiyev.

14. Başlamaq, şüru etmək, girişmək, iqdam etmək. *Pırpız Sona çəpik çalır, Molla Abbas düşür oynamağa.* C.Məmmədquluzadə.

15. Bərqərar olmaq, meydana gəlmək, olmaq. *Sakitlik düşmək.* – [Əmi:] *Ancaq bir az səbir lazımdır. İşlər hamısı düzələr, barışıq düşər.* N.Nərimanov.

16. Çatmaq, yetişmək. *Bir azdan* [Rüstəm] *dərənin içinə düşdü.* S.Rəhimov. *Mənim düşdüyüm stansiya balaca bir yer idi.* İ.Əfəndiyev. *Kəndə axşam düşdüm.* S.Rəhman.

17. Dərəcəsi, şiddəti, səviyyəsi, miqdarı və s. azalmaq, əskilmək, zəifləmək, enmək. *Suyun səviyyəsi yavaş-yavaş düşür. Havanın temperaturu çox düşmüşdür.* // Gücü, qüvvəti azalmaq, üzülüb əldən düşmək, qüvvətini itirmək. // Seyrəkləşmək, zəifləmək. *Ürəyinin fəaliyyəti düşmüşdür. Nəbzi düşmüşdür.* // Təzyiqi azalmaq. *Barometr düşür. Qan təzyiqi düşmüşdür.* // Ucuzlaşmaq, aşağı enmək. *Qiymətlər aşağı düşmüşdür. Birjada aksiyalar düşdü.* // Öz qiymətini, əhəmiyyətini, dəyərini, etibarını itirmək, alçalmaq. *Kollektivin nəzərindən düşmək.*

18. İtirmək, qeyb etmək, məhrum olmaq. *Hörmətdən düşmək. Gözəllikdən* (*təravətdən*) *düşmək. – Ey bürci-səltənət mahi-ənvəri; Düşməyəsən, görüm, ziyadən səni.* Q.Zakir. *Çöllərdəki yaşıl əkinlər lazımınca boy atmadan təravətdən düşürdü.* S.Hüseyn. *Onlar ilə tez-tez vuruşmasaq biz; Dava vərdişindən düşərik təmiz.* H.K.Sanılı. // Bir hissin keçib getdiyini, yox olmasını bildirir. *Həvəsdən düşmək. Könüldən düşmək. – Mən özüm də ziyafətə getmək həvəsindən düşmüşdüm.* M.S.Ordubadi. // Məhrum olmaq, əlindən çıxmaq. [Müqim bəy] *dünən pristavlıq rütbəsindən düşəndə dayana bilmirdi, bəs bu gün qəza rəisliyindən düşsə necə dayanacaqdı?!* S.Rəhimov.

19. Yorğunluqdan, soyuqdan və s.-dən keyimək, üzülmək, tabsız olmaq, taqətini itirmək. *Soyuqdan barmaqlarım düşdü.* – [Mahmud:] *Balta vurmaqdan qollarım düşdü, əllərim suluq-suluq qabar oldu.* Ə.Haqverdiyev.

20. Təsadüf etmək, təsadüf olmaq, rast gəlmək, vaqe olmaq. *Yolum düşdü, gəldim. Kitab düşdü, aldım. – Baba, bu gün bizim xanəmizdə nadir bir ittifaq düşdü.* M.S.Ordubadi. [Aydəmir:] *Mən bir işə min bir adam qarışdırmaq istəmirəm, işdi düşdü, vuruşduq.* C.Cabbarlı. // Keçmək, təsadüf etmək.

21. Bəxtinə çıxmaq, payına çıxmaq, qisməti olmaq. *Uduş 35 nömrəli biletə düşdü. Mükafat kimə düşdü? Püşk ataq, kimə düşərsə, o getsin.*

22. Çatmaq, yetişmək, yaxud çatmalı, yetişməli olmaq. *Adam başına neçə düşür? Hərəyə üç manat düşür. – Nurəddin öz-özünə deyir: – Demək ki, mən ölsəm, malım Gülpəriyə düşəsidir... Bu sadə fikri mən indiyə kimi niyə anlamamışam?* S.S.Axundov.

23. Xeyri olmaq, xeyir vermək, faydası olmaq, köməyi olmaq, yaxşı təsir etmək, yaramaq. *Bu dərman mənə düşmür. Dəniz havası xəstəyə yaxşı düşür. Oranın suyu bizə düşmədi. Orduda xidmət etmək ona düşdü. – Düşmədimi o ruh açan, canverici hava sənə?* Ə.Nəzmi. // Xoşbəxtlik, rifah gətirmək, şükümlü olmaq. *Oraya getmək mənə düşmədi*.

24. Uyğun olmaq, uymaq, münasib olmaq, uyğun gəlmək, düz gəlmək, yaraşmaq. *Açar qıfila düşmür.* // Tutmaq, yaraşmaq, uyuşmaq. [Mayanın] *başında paltosunun rənginə düşən ipək yaylıq vardı*. M.İbrahimov.

25. Sayılmaq, olmaq, münasib olmaq. *Mənim deməyim pis düşər. Bu, heç yaxşı düşmədi. – Mənim ərizə verməyim yaxşı düşməz.* Ə.Sadıq.

26. Aid olmaq, üzərində yük olmaq, yüklənmək, üzərində qalmaq. *Üzərinə məsuliyyət düşmək. Bütün qayğı onun üzərinə düşmüşdür. İşin çətinliyi bizim üzərimizə düşəcəkdir.*

27. Hər hansı bir vəziyyət, şərait və s. içərisində olmaq; uğramaq, düçar olmaq, giriftar olmaq. *Bəlaya düşmək. Fəlakətə düşmək. Qaranlığa düşmək. Soyuğa düşmək. Küləyə düşmək. Xəstəliyə düşmək*. – [Ələkbər:] *..Hər kim bu arvadın üzünə baxsa, sill azarına düşər*. N.Vəzirov. *..Çıxılmaz bir uçuruma düşdüyünü anladıqca dərd* [Səriyyənin] *ürəyini sıxırdı*. M.İbrahimov. ☐ **Ayrı düşmək, aralı düşmək, uzaq düşmək** – uzaqlaşmaq, bir-birini görməmək, əlaqəni itirmək. *Taki səndən düşəli ayru, əya ruhirəvan; Gözümün yaşı mənim qətreyi-baran kimidir.* Xətayi. *Necə ağlamayım mən, ağlamazmı; Bir kəs ki yarından uzağa düşər?* Q.Zakir. // Bir hal almaq, bir şəkil almaq. *Çimənlərin bədənləri istidən mis rənginə düşmüşdü.*

28. Avara-sərgərdan dolaşmaq, gəzmək (bu mənada adətən tərkib halında işlənir). *Küçələrə düşmək. Çöllərə düşmək*. – [Kərəm:] *Oldum xərabati, düşdüm səhraya; Xərabat əhlinə yol nəyə lazım?* "Əsli və Kərəm". *Səbr eyləmədi bu dərdü-dağə; Qatlanmadı, düşdü daşə-dağə*. Füzuli. *Bu bağda biz ol güli-rənadan usandıq; Divanə olub daməni-səhralara düşdük*. S.Ə.Şirvani.

29. Bu və ya digər bir hissə qapılmaq, onun həvəsində olmaq, bir şeyin xəyalında olmaq. *Niyyətə düşmək. Həvəsə düşmək. Eşqə düşmək* (aşiq olmaq, vurulmaq). – [Kərəm:] *Qürbət eldə məlul, məhzun qalmışam; Eşqinə düşəli Məcnun olmuşam*. "Əsli və Kərəm". *Düşdü yenə dəli könül gözlərinin xəyalinə*. Nəsimi. *Nəbi nökərçiliyin "ləzzətini" gördüyü üçün rəncbərlik etmək fikrinə düşür.* "Qaçaq Nəbi". *Neçə ildir ki*, [Məhəmmədhəsən əmi] *də ömrünün sonunda Kərbəla ziyarəti qəsdinə düşüb.* M.İbrahimov.

30. Qabağınca, dalınca, ya yanınca getmək, qoşmaq. *Qabağa düş, yol göstər. İrəli düşmək. Dalınca düşmək* (izləmək, təqib etmək). *Yanına düşmək* (yanınca getmək). – [Rəsul:] *Düş qabağımıza, bizi apargilən qəhvəxanaya.* "Aşıq Qərib". *Pişxidmətbaşı və Xacə Mübarək düşdülər qabağa, bir-bir əndərun otaqlarını göstərməyə şüru etdilər.* M.F.Axundzadə. [Fərhad] *tez durub özünü bulvara salır, gah o qızın, gah bu qızın dalınca düşürdü.* C.Cabbarlı. [Bəbir bəy:] *Bəs* [Qumru] *məni qoyub, yamacın rəncbərinin dalınca niyə düşsün?* Mir Cəlal.

31. Bir şey üçün hədəf olmaq (bu mənada adətən tərkib halında işlənir). *Qız qayınqudanın, qayınatanın, baldızın, qayınananın hökmünə əsir olar, onların dedi-qodusuna düşərdi*. H.Sarabski.

32. Keçmək. *Bir əlimə düşəydi... – Biçarə insanlar bir seydi-məzlum və qafil deyillərmi ki, anadan olan gündən təbiət səyyadının çənginə düşür, bir də dünyanı tərk etməklə ondan xilas olurlar?* C.Cabbarlı.

33. *məc.* Özünə fikir verməyərək, simaca və mənən acınacaqlı, düşkün bir hal almaq. *Axır zamanlar o, çox düşmüşdür.* // Cismən zəifləmək, arıqlamaq; qocalmaq. *Atan necədir? Çox düşməyib ki?* İ.Əfəndiyev.

34. Vaqe olmaq, yerləşmək. *Kənd yolun sağ tərəfinə düşür. Düz baxanda klub sol tə-*

*rəfə düşür. Arada bir dağ düşüb. – Hər il bu zaman yolun ətəklərinə qədər çadırlar, obalar düşərmiş.* Mir Cəlal.

35. Əmələ gəlmək, düzəlmək, salınmaq. *Meşədən cığır düşübdür.*

36. Sataşmaq, dəymək, görmək. *Gözü qarşıdakı adama düşəndə duruxdu.*

37. Yayılmaq, eşidilmək. *Kəndə küy düşdü. Belə şayiə düşüb ki... – Nağara-zurna səsi ensiz çayın kənarından ucalıb qalxan sıldırım qayaya düşüb .. yatmışları da oyatmaq istəyirdi.* Ə.Əbülhəsən. *Şəhərə böyük bir səs düşdü.* S.Rəhman.

38. Birinci dəfə yem yeməyə başlamaq. *Quzu ota düşüb*.

39. **Düşdükcə** şəklində – təsadüf etdikcə, rast gəldikcə. *Bizə lazım olan şeyləri düşdükcə ondan-bundan və bir parasını pul ilə Quba meydanından aldıq.* C.Məmmədquluzadə.

40. **Düşəndə** şəklində – vaxt, fürsət, imkan olanda, təsadüf gətirəndə, yeri gəldikcə, arabir, ara-sıra, bəzən, gah-gah. *Düşəndə bir bizə də gəl. – Düşəndə gah-gah sərafraz eylə; Saf unutma bu Zakiri, mürvətdi.* Q.Zakir. *Hər kağızın birinə məşədi iki qəpik, üç qəpik, ya düşəndə bir şahı alır.* C.Məmmədquluzadə. [Dərviş:] *Mən də düşəndə bir sizin yanınıza gəlib, keçmiş macəralardan nağıl edərəm.* Ə.Haqverdiyev. [Nadir] *Məstan bəyin küçəsindən keçməzdi və düşəndə Zeynəbi yalnız arabir kəndin kənarında və ya bulaq başında görərdi.* B.Talıblı.

41. **Düşsə** şəklində – təsadüf etsə, rast gəlsə, imkan olsa. *Düşsə, mənə də al. –* [Əhməd] *cığırla darılığa doğru gedir, rastına düşsə, Kürün o üzündən uçub dənlənməyə gələn qırqovullardan birini vurmaq istəyirdi.* İ.Şıxlı.

42. **Nə düşüb, nə düşüb ki** şəklində – nə dəxli var, nə aidiyyəti var, nə münasibəti var, səbəb nədir (ki), nə səbəbə (görə), nə işinə gərək, dəxli yoxdur, aidiyyəti yoxdur. *Sənə nə düşüb... Ona nə düşüb... –* [Cəmil:] *Axı mənə deyən gərək, sənə nə düşüb ki, naşükür adama yaxşılıq edirsən?* M.Hüseyn.

43. Bir çox isimlərə qoşularaq, müxtəlif ifadələr düzəldilir: məs.: gözü düşmək (b a x **göz**), ürəyi düşmək (b a x **ürək**), əldən düşmək (b a x **əl**), bərkə düşmək (b a x **bərk**), əl-ayağa düşmək (b a x **əl-ayaq**).

◊ **Düşər-düşməzi olar** – nəticəsi, aqibəti bəlli olmayan, yaxud şübhəli olan şey haqqında.

**DÜŞMƏLİ** *sif.* Düşməyə, düşmək (7-ci mənada) üçün yararlı (münasib) olan. *Düşməli yer. –* [Kərbəlayı Xudaverdi:] *Burada bir düşməli karvansara yoxdurmu?* Ə.Haqverdiyev.

**DÜŞMƏN** is. [*fars.*] 1. Birinə qarşı ədavət, düşmənçilik bəsləyən və onunla mübarizə aparan, çəkişən şəxs. *Onun düşməni var. – Ey məh, mənimlə dustlərim düşmən eylədin; Düşmən həm eyləməz bu işi, kim sən eylədin.* Füzuli. [İzzət:] *Düşmən hər nə qədər aciz olsa da; Məğrur olub, kiçik sanma dünyada.* H.Cavid. // Birinə pislik etmək, zərər vurmaq istəyən, birinin pisliyini istəyən adam; ədavətkar, əleyhdar. *Düşmənin tikəsindən dostun silləsi yaxşıdır.* (Ata. sözü). *Hacı Əbüləzim dürüst qulaq verəndən sonra dedi: – Kişi, məgər sən öz qızının düşmənisən?* Ə.Haqverdiyev. [Bəhram:] *Ata öz oğluna olarmı düşmən?* A.Şaiq. ☐ **Düşmən gözü ilə baxmaq** – özünə düşmən hesab etmək. *Doğrusu, iki məhəllə ata-babadan bir-birinə düşmən gözü ilə baxırdı.* N.Nərimanov. **Düşmən kəsilmək** – düşmən olmaq. *Qorqud qanı axdı damarımızdan, Özümüz Qorquda düşmən kəsildik.* B.Vahabzadə. *Ülkəri gözü tək istədiyindən; Düşmən kəsilmədi o, Əmirxana...* S.Vurğun. *Bu qədər acgözlüklə topladığı bu sərvət; İndi düşmən kəsilmiş, edirdi ona nifrət.* N.Rəfibəyli.

2. Müharibədə əks cəbhədə vuruşan adam, dövlət və s.; yağı. *Düşməni darmadağın etmək. Düşməni məğlub etmək. Düşmənə atəş! – Qoç Koroğlu qonar olsa yəhərə; Yağı düşmənləri salar qəhərə.* “Koroğlu”. *Balaca uşaqların düşmən qabağına Quran götürüb çıxmaqları, gələcək üçün bir tarixdir.* C.Məmmədquluzadə. *Düşmən bütün cəbhə boyu ricət edirdi.* M.Hüseyn.

3. Zərər gətirən, zərərli olan şey haqqında. *Xatircəmlik bizim ən böyük düşmənlərimizdəndir. – Dilim özümə düşməndir.* (Məsəl).

4. Yarışda, oyunda, mübahisədə iştirak edən qarşı tərəf. *Düşmən şahını mat etmək* (şahmatda).

**DÜŞMƏNANƏ** *zərf* və *sif.* [*fars.*] Düşməncəsinə. *Gətirilən xəbərlərin əsasını Fəxrəddinin Əmirə qarşı hazırladığı düşmənanə hərəkət təşkil edirdi.* M.S.Ordubadi.

**DÜŞMƏNCƏ(SİNƏ)** *zərf* Düşmən kimi, düşmənə qarşı olduğu kimi. *Düşməncəsinə münasibət. Düşməncəsinə hərəkət.* – [Qətibə:] *Onun* [Atabəyin] *qonşu hökumətlərlə olan rəftarı olduqca düşməncəsinədir.* M.Ordubadi.

**DÜŞMƏNÇİLİK** b a x **düşmənlik**. ..*Qaraca qızın nə qədər Ağca xanıma ürəyi yanıb yazığı gəldisə, bir o qədər də mürəbbiyəyə düşmənçiliyi artdı.* S.S.Axundov. [Səfər bəy:] *Çox mübarək, çox şadam ki, mahalımızın rəhbərləri bundan sonra daha düşmənçilik etməyib, məhəbbət və sevgi ilə yaşayacaqlar.* B.Talıblı. *Qohumluq düşmənçiliyə və ədavətə çevrilərdi.* H.Sarabski.

**DÜŞMƏNLİK** *is.* Düşməncəsinə münasibət və hərəkət; ədavət. *Düşmənlik etmək.* – *Yerişindən elə bildim sərsandır; Dostluğunan düşmənliyi birdəndir.* "Koroğlu". [Bülənd] *dünənki düşmənliyə inanmayırdı.* Ə.Əbülhəsən.

**DÜŞÜK** *sif.* 1. Vaxtından əvvəl doğulmuş, yarımçıq. *Düşük uşaq.* // *is.* Vaxtından əvvəl doğulan uşaq. *Yeddiaylıq düşük.*

2. Aşağıya düşmüş, sallanmış, düşmüş.

3. *məc.* Alçaq, dəyərsiz, qüsurlu, biçimsiz, yöndəmsiz, nöqsanlı.

**DÜŞÜKLÜK** *is.* 1. Düşük şeyin hal və keyfiyyəti.

2. Dəyərsizlik, yöndəmsizlik, qüsurluluq.

**DÜŞÜM¹** *is.* Uyğunluq, münasiblik, yaraşıq. *Bu rəngin düşümü yoxdur.*

**DÜŞÜM²: səs düşümü** – dilçilikdə: ikinci söz saitlə başlandıqda birinci sözün axırındakı saitin düşməsi hadisəsi; məs.: əliaçıq – əlaçıq, Əli Əkbər – Ələkbər.

**DÜŞÜMLÜ** *sif.* Düşümü olan, uyğun, münasib, yaraşıqlı. *Düşümlü hörgü. Düşümlü yazı.*

**DÜŞÜMLÜLÜK** *is.* Düşümlü şeyin halı; uyğunluq, münasiblik, yaraşıqlıq.

**DÜŞÜMSÜZ** *sif.* Düşümü olmayan, uyğunsuz, münasibsiz, yaraşıqsız.

**DÜŞÜMSÜZLÜK** *is.* Düşümsüz şeyin halı; uyğunsuzluq, münasibsizlik, yaraşıqsızlıq.

**DÜŞÜNCƏ** *is.* 1. Xəyal, fikir. *Düşüncələrə dalmaq.* – *Polad qərq olaraq düşüncələrə; Əlvida elədi ilk məhəbbətə.* M.Rahim. // Fikrə, xəyala gələn şeylər; xəyalat. *Düşüncələrindən ayrıla bilmir.* – *Mən belə acı düşüncələr içində olduğum halda, birdən Xədicəgildən bir ağlaşma səsi qopdu.* S.Hüseyn. *Poladzadə ayağa durduqda Qüdrətov sanki daxilən silkinib düşüncələrdən azad oldu.* Ə.Vəliyev. *Məsmə xala düşüncədən ayıldı.* S.Rəhman.

2. Düşünmə nəticəsində hasil olan qənaət; anlaq, şüur, dərrakə. *Siyasi düşüncənin artması.* – *Düşüncələr yeni, duyğular yeni; Dəyişmiş dünyanın söhbəti, sazı.* S.Vurğun. *Cəlil Məmmədquluzadə xalqın həyat və düşüncəsindəki bütün mənfi cəhətləri tənqid edirdi.* M.İbrahimov. // Ağıl, kamal, qanacaq, mərifət. *Düşüncəsini itirmək.* – *Düşüncə, tərbiyə, zəka zinəti; Budur qadınlığın, məncə, qiyməti.* S.Vurğun.

**DÜŞÜNCƏLİ** *sif.* 1. Düşüncəsi olan, ağıllı, şüurlu, anlaqlı, qanacaqlı, dərrakəli, mərifətli, fərasətli. Düşüncəli uşaq. – ..*Sizin Qətibə ilə olan rəftarınız düşüncəli bir hökmdarın rəftarı deyildi.* M.S.Ordubadi. *Alnı düşüncəli, qolları sarqıq, Yetim baxışlarla boynunu burmuş.* M.Müşfiq. // Zərf mənasında. *Maral bülbül nəğmələrini dinləyərək məhzun və düşüncəli bir halda .. gedir.* H.Cavid. *Tahirin bu cür düşüncəli və ciddi danışmağı Lətifəni sevindirdi.* M.Hüseyn.

2. Düşünmə nəticəsində fikrə dalmış, fikirli, qayğılı. [Mirzə Əliməmməd:] *Otur, – dedi və qələmi qələmdana qoyaraq Səfəri düşüncəli nəzərlə süzdü.* Çəmənzəminli. *Düşüncəli gözlərində bir təbəssüm duyuram mən; Bəllidir ki, bir müjdədir o, gələcək nəsillərdən.* M.Dilbazi. *Nərgiz bu gün sakit və düşüncəli idi.* Ə.Vəliyev.

**DÜŞÜNCƏLİLİK** *is.* Şüurluluq, anlaqlılıq, dərrakəlilik, fərasətlilik, mərifətlilik.

**DÜŞÜNCƏSİZ** *sif.* 1. Düşüncəsi, şüuru olmayan, ya çatmayan; şüursuz, dərrakəsiz, anlaqsız, fərasətsiz. *Düşüncəsiz adam.*

2. Ağılsız, ağla uymayan, ağla zidd. *Düşüncəsiz hərəkət* (*iş*).

**DÜŞÜNCƏSİZLİK** *is.* 1. Düşüncənin olmadığı hal, düşüncə yoxluğu; şüursuzluq, anlaqsızlıq, dərrakəsizlik, fərasətsizlik.

2. Düşüncəsiz, ağılsız iş; ağla, şüura uymayan hərəkət. *Zeynal, Şərifzadənin göstərəcəyi yol ilə getməyə hazır idi. Etiraf edirdi ki, Mehribanı boşamaqda düşüncəsizlik etmişdir.* S.Hüseyn.

**DÜŞÜNDÜRMƏ** "Düşündürmək"dən *f.is.*

**DÜŞÜNDÜRMƏK** *icb.* 1. Düşünməyə, fikirləşməyə məcbur etmək.

2. Əndişəyə salmaq, təlaşa salmaq, narahat etmək. *Onun səhhəti bizi çox düşündürür. İşlərin gedişi bizi düşündürməyə bilməz.* – *Məni bu təsadüflər o qədər də düşündürmürdü.* M.S.Ordubadi. *Məşədi bəyin dəlilləri Rəşid bəyi xeyli düşündürdü...* M.Hüseyn. *Hərdən düşündürür bu həyat məni.* N.Rəfibəyli.

**DÜŞÜNMƏ** "Düşünmək"dən *f.is.*

**DÜŞÜNMƏK** *f.* 1. Bir şeyin haqqında fikirləşmək; fikir etmək. *Gələcəyini düşünmək. Sabahı düşünmək.* – *Ömrün varlığını izləyən şair; Bu günə dair; Nə isə düşünürdü haman salonda.* S.Vurğun. // Fikirləşib aramaq, fikirləşib tapmağa çalışmaq. *Bir çarə düşünmək. Lazımi tədbirlər düşünmək. Məsələnin həllini düşünmək.* // Ümumiyyətlə, fikirləşmək, götür-qoy etmək. *Bu xüsusda çox düşünmüşük. Əli alnında düşünürdü.* – *Düşünürsən: insan insandır; Biri nədən doğma, mehriban, qayğıçəkən; Biri sərt, qılıqsız, ögey?* R.Rza. *Əziz bir papiros yandırıb düşünməyə başladı.* S.Rəhman. *İnsan düşünməyə tapmayır macal; Tökülür meydana bomba dalbadal.* M.Rahim. *İndi Kamal nə edəcəyini deyil, necə edəcəyini düşünürdü.* M.Rzaquluzadə. ☐ **Düşünüb-daşınmaq** – fikirləşmək, düşünmək. [Şeyda:] *..Duyğusuz bir makina kimi düşünüb-daşınmaq, yazıb-pozmaq neçin?!* H.Cavid. *Orxan çox düşünüb-daşındı və axırda inandırdı ki, Bənövşə görüşə gəlməyəcək.* İ.Məlikzadə.

2. Təsəvvür etmək, zənn etmək, ağlına gətirmək, xəyalına gətirmək, xəyal etmək. *Kim düşünə bilər ki...* – *Lakin həyatın gedişi Fərmanın düşündüyü kimi olmadı.* Ə.Sadıq. // Yada salmaq, fikrinə gətirmək, xatirinə gətirmək. *Bu saat hələ səni düşünürdüm. Bir şey düşündüm.* – [Əbdüləli bəy:] *Doğrudur, mən də onu düşünürdüm.* C.Cabbarlı. *Yazıq babaları düşündükcə mən; Ağrımış ürəyim bəlkə min kərə!* S.Vurğun.

3. Başa düşmək, anlamaq, dərk etmək. *Heç bir şey düşünə bilməmək.* – *Bunu hətta düşünüb cümlə müsəlman uşağı; Hər vilayətdə deyirlər: Pa atonnan, ölüb ...ə!* M.Ə.Sabir. *Şirzad düşündü ki, Yarməmmədi bu qədər eybəcər edən qorxudur.* M.İbrahimov.

4. Narahat olmaq, əndişə etmək, fikir çəkmək. *Xəstə çox düşünür.* // Fikrini çəkmək, haqqında narahat olmaq, qeydinə qalmaq. *Ancaq özünü düşünmək.* – *Özünü düşünür, özünü hər kəs; Bu qoca dünyamız hara gedir bəs?* B.Vahabzadə.

**DÜŞÜNÜLMƏ** "Düşünülmək"dən *f.is.*

**DÜŞÜNÜLMƏK** "Düşünmək"dən *məch.*

**DÜŞÜNÜLMÜŞ** "Düşünülmək"dən *f.sif.* *Düşünülmüş plan. Düşünülmüş tədbir.* – *Məhsəti xanım ziyafətə daxil olan zaman, vaxt ikən düşünülmüş tədbirlər tamamilə əhəmiyyətdən düşdü.* M.S.Ordubadi.

**DÜŞÜNÜŞ** *is.* Düşünmək işi, düşünmək tərzi; təfəkkür, mülahizə.

**DÜŞÜNÜŞMƏ** "Düşünüşmək"dən *f.is.* *Dövlət zarafatyana, kənddə bir neçə adamın özü ilə çox bərk düşünüşməsindən söhbət salıb dedi.* Ə.Əbülhəsən.

**DÜŞÜNÜŞMƏK** *f.* Düşmən olmaq, kin və ədavət saxlamaq. [Balaxanım Dadaş Lələşovdan soruşdu:] *Sən niyə Şiraslanla düşünüşmüsən?* S.Rəhimov.

**DÜŞÜRDÜLMƏ** "Düşürdülmək"dən *f.is.*

**DÜŞÜRDÜLMƏK** "Düşürtmək"dən *məch.*

**DÜŞÜRMƏ** "Düşürmək"dən *f.is.*

**DÜŞÜRMƏK** *f.* 1. Bir şeyi götürərək və ya başqa vasitə ilə aşağı endirmək, aşağı salmaq. *Kitabları aşağı düşürmək lazımdır.* – [Qadın:] *Yox! Yalvarıram sənə! Amandır! Bu evdə mənə o qəndildən başqa bir şey lazım deyil; qurbanın olum, de ki, onu düşürüb mənə versinlər.* Ə.Haqverdiyev. // Bir şeyin üstündən qaldırıb yerə qoymaq, bir yerdən düşməsinə kömək etmək. *Uşağı atdan*

*düşürmək. Yükü maşından düşürmək. – Dərbari-şahinin qapısında fərmanlar Yusif Sərracı atdan düşürdülər.* M.F.Axundzadə. *Qərənfil xala keçən il tikdirdiyi cücəgözü çit döşlüyü ilə yapışıb qazanı yerə düşürdü.* Ə.Vəliyev.

2. Bilmədən əlindən buraxmaq, əlindən salmaq. *Stəkanı əlindən düşürüb sındırdı.* // Düşməsinə imkan vermək. *Meyvələri tordan düşürə-düşürə* (z.) *gedirdi. Bütün şeylərini yolda düşürdü.* // Bilmədən toxunaraq düşməsinə səbəb olmaq, salmaq, yıxmaq, devirmək. *Dibçəkləri pəncərədən düşürmək.*

3. *məc.* Alçaltmaq, endirmək, hörmətsiz etmək. *Kollektivin gözündən düşmək.*

4. Salmaq, məhrum etmək, devirmək. *Padşahı taxtdan düşürdülər. Vəzifəsindən düşürmək. – ..Heç kəs çar istilasının əzəmətini düşürmək cürətində bulunmadı.* M.S.Ordubadi.

5. Dərmək. *Adam var, dolanar səhranı, düzü; Adam var, düşürər gülü, nərgizi.* "Abbas və Gülgəz". *Bir gün qadınlarla çocuqlar moruq və çiyələk düşürməyə getmişdilər.* A.Şaiq. // Dağıtmaq, qoparıb götürmək. *Bir gün Kəblə Cahangir gördü ki, oğlu Ağabala divardan sərçə yuvası düşürür.* Çəmənzəminli.

6. Salmaq, məruz etmək, düçar etmək. *Pis vəziyyətə düşürmək. – Mən, zarafat deyil, ey sevdiciyim, can yıxıram!.. Sənsən, əlbət, düşürən bu qara sevdaya məni.* S.Vurğun.

**DÜŞÜRTMƏ** "Düşürtmək"dən *f.is.*

**DÜŞÜRTMƏK** 1. Bax **düşürmək** 1-ci mənada. *Qazanı yerə düşürtmək.*

2. *icb.* Aşağıya, yerə düşməyə, enməyə kömək və ya məcbur etmək. [Səlim] *kəndlərinin bərabərinə çatanda maşını əyləndirdi, sərnişinlər ona kömək etdi, onu yük maşınından düşürtdülər.* S.Rəhimov.

**DÜŞÜRÜLMƏ** "Düşürülmək"dən *f.is.*

**DÜŞÜRÜLMƏK** "Düşürmək"dən *məch. Şeylər aşağı düşürüldü. Uşaqlar maşından düşürüldülər. – Şose yolunun kənarında, körpünün döngəsində maşınlar və arabalar dayandırılır, yaralılar düşürülür, içəri qazmalara aparılırdı.* S.Rəhimov.

**DÜŞVAR** *sif.* [*fars.*] *klas*. Çətin, müşkül, ağır. *Ey deyən: səbr qıl, ah eyləmə yarı görcək; Mənə düşvardır ol, gər sənə asan görünür.* Füzuli. *Müşküldü mən kənara düşüm kuyi-yardən; Düşvardır ki, əl üzüm ol gülüzardən.* X.Natəvan. ◻ **Düşvar olmaq** – çətin olmaq. *Nə təamü nə fərşü nə camə; Xəlqə düşvar olub bu həngamə.* M.Ə.Sabir. *..İnsanın qədəri ilbəil artdığına, boş yerlər azaldığına görə, heyvanı saxlamaq gün-gündən düşvar olur*. H.Zərdabi.

**DÜTAR** *is.* [*fars.*] Tara oxşar ikisimli musiqi aləti.

**DÜVƏL** *is.* [*ər.* "dövlət" söz. cəmi] *köhn. kit.* Dövlətlər. *Düvəli-müəzzimə* (*keçmişdə böyük dövlətlərin ümumi adı*).

**DÜYDÜ** *is. məh*. Balta küpünün arxası. *Baltanın düydüsü*.

**DÜYDÜRMƏ** "Düydürmək"dən *f.is.*

**DÜYDÜRMƏK** "Düymək"dən *icb. Atın quyruğunu düydürmək.*

**DÜYƏ** *is.* İnəyin, camışın, ceyranın, maralın hələ kələ və ya təkəyə gəlməmiş, doğmamış balası. *Maral düyəsi. İnək düyəsi. – Yelini dolmuş inəklər balasına çatmaq üçün mələyir, yazabuğalar, düyələr bir-birini buynuzlayıb qovurdular.* İ.Şıxlı.

**DÜYƏCƏ** *is.* Balaca düyə. *Bizim düyəmiz böyümür, elə düyəcə kimi durur.* S.Rəhimov.

**DÜYƏLƏK** *is. məh.* Hələ dəyməmiş xırda qarpız və ya qovun. ◻ **Düyələk kimi** – yupyumru, gipgirdə. *Müqim bəyin qarnı qarpız kimi qalxıq, başı da aran yerinin düyələyi kimi yupyumru idi.* S.Rəhimov.

**DÜYƏLƏKBAZ** *sif.* [düyələk və *fars.* ...baz] *dan.* 1. Davakar, dəbbəçi.

2. Fırıldaqçı, kələkbaz; hoqqabaz.

**DÜYƏLƏKBAZLIQ** *is. dan.* 1. Davakarlıq.

2. Fırıldaqçılıq, kələkbazlıq; hoqqabazlıq.

**DÜYM** [*holl.*] 2,54 santimetrə bərabər uzunluq ölçüsü.

**DÜYMƏ¹** *is.* 1. Paltarı ilməkləmək üçün (bəzən də yaraşıq üçün) sümükdən, metaldan və ya başqa materialdan qayrılan, adətən yuvarlaq şəkildə olan şey. *Yaxa düyməsi. Cib düyməsi. Şalvar düyməsi. – Əynində boz çuxa, belində kəmər; Çuxanın üstündə gümüş düymələr.* B.Vahabzadə.

2. Qapının rəzəsi, cəftəsi, həncəməsi keçirilən başı deşik mıx. *Cəftənin düyməsi çıxmışdır.*

3. Mıxın yumru təpəsi. *Mıxın düyməsi sınmışdır.*

4. Qönçə, puçur, tumurcuq. *Ağacın düymələri zoğ atıban yarpaq açır; Sonra əlvan çiçəyi xeyli zərifanə gəlir.* R.Əfəndiyev. ☐ **Düymə bağlamaq** – ağaclarda ilk düymələr (tumurcuqlar) əmələ gəlmək. *Ağaclar düymə bağlayıb. – Təzə düymə bağlamışdı; Ağacların budaqları.* M.Dilbazi.

5. Barmaqla basmaqla elektrik xəttindəki cərəyanı qapamaq, bağlamaq və müxtəlif mexanizmləri işə salmaq üçün mütəhərrik düyməcik; knopka. *Düyməni burursan; Efirdə səslər...* B.Vahabzadə. *Ağıllı maşınlar yaranır; Düyməsini basırsan belə maşın müəllimin.* R.Rza.

**DÜYMƏ²** "Düym" sözünün canlı dildə işlənən forması. *Həsən bəy əzbərdən quyuların hamısının dərinliyini ayrı-ayrı olaraq sajın və futla deyil, hətta düymənin dörddən birinə qədər belə bilirdi.* B.Talıblı.

**DÜYMƏ³** "Düymək"dən *f.is.*

**DÜYMƏCƏ** *zərf* Düymə qədər; az, azacıq. *Dəvəcə boyun olunca, düyməcə ağlın olsun.* (Ata. sözü).

**DÜYMƏCİK** *is.* 1. Kiçik düymə.

2. Kiçik tumurcuq.

**DÜYMƏÇƏ** *is.* 1. Puçur, açılmamış tumurcuq. *Yazda ağacların düyməçələri irilənməyə başlayır. – Nərgiz düyməçələri; Püstə kimi yarılıb ortasından neçələri.* R.Rza. *Məxmər otların arasından büllur sular süzülür, qönçələrə, düyməçələrə parlaq incilər düzülürdü.* M.Rzaquluzadə.

2. Kiçik düymə.

3. Elektrik zəngini çaldırmaq və elektrik işığını yandırıb-söndürmək üçün barmaqla üstündən basılan mütəhərrik düymə; knopka. *Ay dədə, işığı yandırsana, – deyib, Pərşan divardakı düyməçəni basdıqda stolun üstündəki böyük lampa hər tərəfi işıqlandırdı.* M.İbrahimov. *Həkim düyməçəni basdı.* Mir Cəlal.

4. Kağızı və s.-ni bərk şeyə bənd etmək üçün təpəsi enli və yastı metal mıxcıq; knopka.

**DÜYMƏÇƏLƏMƏ** "Düyməçələmək"dən *f.is.*

**DÜYMƏÇƏLƏMƏK** *f.* Düyməçə (4-cü mənada) ilə bənd etmək. [Gəldiyev] *Vahidin layihəsini səliqə ilə düyməçələdi, başladı üzünü köçürməyə.* Mir Cəlal.

**DÜYMƏÇƏLƏNMƏ** "Düyməçələnmək"dən *f.is.*

**DÜYMƏÇƏLƏNMƏK** *f.* 1. Düyməçə gətirmək, tumurcuqlanmaq, puçurlanmaq. *Ağaclar düyməçələnir. – Yaşıl yarpaqların arasında düyməçələnmiş tüklü meyvəni seçmək olurdu.* M.İbrahimov.

2. Düyməçə (4-cü mənada) ilə bənd edilmək.

**DÜYMƏÇƏLİ** *sif.* Düyməçəsi olan, tumurcuqlu. *Göy düyməçəli ağac. – ..Meşə yolunu kollar, qırmızı çiçəkli, göy düyməçəli maralotular, ağ, sarı və qırmızı göbələkli kötüklər tuturdu.* S.Rəhimov.

**DÜYMƏK** *f.* 1. Kəndirin, ipin və s.-nin bir yerini ilmək halına salmaq; ilgəkləmək, düyünləmək, düyün halına salmaq. [Cahandar ağa] *Yəhəri atın belinə qoydu. Qarınaltı qayışları möhkəm çəkdi, üzəngini, yüyəni yoxladı, dal tərəfə keçib atın quyruğunu düydü.* İ.Şıxlı.

2. *məc.* Bağlamaq, calamaq. *Bu sualları bir-birinin ucuna düyə-düyə* (z.) *Güldanə özünü kəndin girəcəyində gördü.* Ə.Vəliyev. ◊ **Qaşlarını düymək** – b a x **qaşlarını düyünləmək** (**"düyünləmək"**də). *Nəcəf qaşlarını düyüb kluba getdi.* M.İbrahimov. **Yumruğunu düymək** – b a x **yumruğunu düyünləmək** (**"düyünləmək"**də).

**DÜYMƏLƏMƏ** "Düymələmək"dən *f.is.*

**DÜYMƏLƏMƏK** *f.* Düyməni, ya düymələri ilgəkdən keçirməklə bağlamaq, qovuşdurmaq. *Köynəyini, paltarını düymələmək. – Məşədi İbad yaxasını düymələyir...* Ü.Hacıbəyov. [Müəllim] *paltosunu geyib düymələdi.* S.Hüseyn.

**DÜYMƏLƏNMƏ** "Düymələnmək"dən *f.is.*

**DÜYMƏLƏNMƏK** 1. *məch.* Düymələri, ya düyməsi ilgəyə keçirilməklə bağlanmaq, qovuşdurulmaq. *Çəhrayı arxalıq* [xanımın] *sinəsində yarımdairə təşkil edərək qızıl toqqa sarılmış incə belində düymələnmişdi.* Çəmənzəminli.

2. *t-siz.* Düymə bağlamaq, tumurcuqlanmaq. *İydə çiçək açır, düymələnir nar; Ellərə muştuluq gətirir bahar.* Ə.Cəmil.

**DÜYMƏLƏTMƏ** "Düymələtmək"dən *f.is.*

**DÜYMƏLƏTMƏK** *icb.* Düyməsini, düymələrini bağlatmaq.

**DÜYMƏLİ** *sif.* 1. Düyməsi olan, düymə ilə bağlanan, düymələnən. *Düyməli köynək. – Əyricə qaşı var, ucu əyməli; Kətan köynək geyib, köksü düyməli.* Aşıq Kərəm. *Gülşad göyzəmin krepsatindən yaxası düyməli, qollu, uzun don geymiş(di*). Ə.Əbülhəsən.

2. Düymələnmiş, düymə açmış, tumurcuqlanmış.

3. Ucu düymə şəklində olan; ucudüyməli. *Hacı Mirzə Həsən bir qutu düyməli peronu Əminüddövlənin qabağındakı mizin üstünə qoydu.* P.Makulu.

**DÜYMƏYARIMLIQ** *sif.* Ölçüsü bir yarım düymə (düym) olan. *Düyməyarımlıq mıx, boru. – O, iyirmi beş santimetrlik, düyməyarımlıq dəmir parçalarından burğaclar hazırlayırdı.* Mir Cəlal.

**DÜYÜ** *is.* İsti iqlimdə sulu yerlərdə (xırlarda) yetişdirilən ağ rəngli dənli bitki (qabıqlı halda buna çəltik deyilir). *Çəltiyin qabığı alınanda düyü əmələ gəlir. Düyü dayaz sularda bitən bir bitkidir. – Yağdan sonra düyü tədarükünün dalına düşürlər, çünki plov düyüsüz olmaz.* C.Məmmədquluzadə. *Ocağın üstündə sədri düyüsü ilə dolu, yanları his bağlamış böyük bir qazan qaynayırdı.* M.İbrahimov.

**DÜYÜÇÜ** *is.* 1. Çəltik yetişdirməklə məşğul olan adam.

2. *köhn*. Düyü taciri, topdan düyü satmaqla məşğul olan adam. *Bakıda iri ticarətlə məşğul olan düyüçülər, xüşgəbarçılar, ipəkçilər, xalçaçılar, qara neftçilər də az deyildi.* H.Sarabski.

**DÜYÜÇÜLÜK** *is*. 1. Düyüçünün işi, peşəsi, məşğuliyyəti.

2. *Sif. mənasında.* Düyü yetişdirməklə məşğul olan, düyü yetişdirən. *Düyüçülük rayonları.*

**DÜYÜLMƏ** "Düyülmək"dən *f.is.*

**DÜYÜLMƏK** "Düymək"dən *məch*. *Kəhər atın quyruğu haça düyülmüşdü.* Ə.Vəliyev.

◊ **Qaşı (qaşları) düyülmək** – b a x **qaş**. *Qaşı düyüldü, üzünün dərisi qızmış qaval kimi gərginləşdi, qulaqları səsə düşdü.* Mir Cəlal.

**DÜYÜM** b a x **düyün**[1]. *Qaşlarının düyümünü; Elə bil kimsə açdı; Qırışdı gözlərinin kənarı; Dodaqların da qaçdı.* R.Rza. *Sayalı arvad kənddə dünyagörmüş ağbirçək sayılırdı. Düyümləri açar, tilsimləri sındırardı.* Mir Cəlal.

**DÜYÜMLƏMƏK** b a x **düyünləmək**. *Tükəzban çarşabın uclarını belinə çarım-çarpaz düyümləyib, oraya – yığıncağa yüyürərdi.* B.Talıblı. *Sənəm sumağı boğazaltısının uclarını .. yoğun hörüyünün altında düyümləmişdi..* Ə.Əbülhəsən.

◊ **Yumruğunu düyümləmək** – b a x **yumruq**.

**DÜYÜMLƏNMƏK** b a x **düyünlənmək**.

**DÜYÜMLÜ** b a x **düyünlü**.

**DÜYÜN**[1] *is.* 1. İki ip və s.-nin bir-birinə bağlanmasından əmələ gələn yumru ilmək yeri, habelə ipin özünün ilmək halına salınmış yeri. *İpin düyününü açmaq.* – [Səttar:] *Yazıq arvadın barmaqları ilmədə qalıb, gözü düyünlərdə.* P.Makulu. ☐ **Düyün düşmək** – dolaşmaq, pırtlaşıq düşmək, düyünlənmək. *İp düyün düşdü.* – [Zalxa:] *Mən heç bunu bağlaya da bilmirəm ki, ha eləyirəm, düyün düşür.* S.Rəhman. [Sarıqlı Mollanın] *qolu düyün düşmüş örkənə bənzəyirdi.* Mir Cəlal. **Düyün salmaq** – dolaşıq salmaq, pırtlaşdırmaq, düyünləmək. **Kor düyün** – açılması çətin olan düyün.

2. Ağac, kol budağının gövdəyə, yaxud yarpağın zoğa birləşdiyi yer. *Ağacın düyünləri. Taxtada çox düyün var, rəndələmək çətindir. Yarpağın zoğa birləşdiyi yerinə düyün deyilir. Palıd ağacının düyünləri.*

3. *məc.* İlişik, həlli çətin məsələ, zor iş, dolaşıqlıq. ☐ **Düyün(ü) açılmaq** – həlli tapılmaq, həll olunmaq. *Heç aləmdə olmayıb belə gün; Həll olub müşkülüm, açıldı düyün.* S.Ə.Şirvani. **Düyünə düşmək** – çətinlik üz vermək, həll edilə bilməmək, dolaşığa düşmək. [İkinci:] *Vallah, səbir eləyincə daha da iş düyünə düşür.* C.Cabbarlı. *Bir işin üstü açılanda, ya bir iş düyünə düşəndə Leylək sinəsini qabağa verib, bəyin "heykəl başına" and içər, divan qulluqçularını inandırardı.* S.Rəhimov. **Düyünü(nü) açmaq** *məc.* – çətin bir məsələnin, işin həllini tapmaq, çarəsini tapmaq, həll etmək, dolaşığı(nı)

açmaq. *Gopnan əməl aşmaz, işə qeyrət gərək olsun; Millət düyünün açmağa himmət gərək olsun.* M.Ə.Sabir.

4. *məc.* Dərd, kədər, qəm, ürək acısı. *Dəsmalın ağdı məndə; Güllüdü, ağdı məndə; Yar, sənin bir "yox" sözün; Düyündü, dağdı məndə.* (Bayatı). *Vidadi xəstəyəm, ey gözüm sağı; Artıbdır sinəmin düyünü, dağı.* M.V.Vidadi. *O necə quş idi yaz gələr bağa; Sinəmi çəkiblər düyünə, dağa..* Xəstə Qasım. *Çəkilib köksümə dağlar, düyünlər.* Q.Zakir. ☐ **Düyün olub boğazında (ürəyində) qalmaq** – bir dərd olub ürəyində qalmaq.

**DÜYÜN**[2] *is.* Toy, şənlik. *Bayraməlisiz toy olmaz, Qənbərsiz düyün.* (Ata. sözü). *Davul, zurna çalındı, qızdı düyün.* A.Şaiq. *Görürəm o dağdakı toyu, düyünü yeni səhnədə.* M.Müşfiq.

**DÜYÜNBAŞ** *is. bot.* Qaymaqçiçəklilər fəsiləsindən düzən və aşağı dağ zonasında bitən, ikişər ləlèkvari kəsimli yarpaqları olan birillik ot bitkisi.

**DÜYÜNCÜK** b a x **düyünçə**.

**DÜYÜNÇƏ** *is.* İçinə şey qoyulub düyünlənmiş yaylıq, parça və s.; bağlama. *Bir tərəfdə tayanın dibində su bardağı, çörək düyünçəsi, əyin paltarı və bir neçə boş çuval.* C.Məmmədquluzadə. *İndi get, nə ayın-oyunun varsa, yığ bir düyünçəyə.* N.Vəzirov. *Pullara əl vurmamaq, xərcləməmək üçün düyünçəyə bağlayıb yük yerində gizlətdi.* Mir Cəlal.

**DÜYÜNÇƏLƏMƏ** "Düyünçələmək"dən *f.is.*

**DÜYÜNÇƏLƏMƏK** *f.* Düyünçə halına gətirmək.

**DÜYÜNÇƏLƏNMƏ** "Düyünçələnmək"dən *f.is.*

**DÜYÜNÇƏLƏNMƏK** *məch.* Düyünçə halına gətirilmək.

**DÜYÜN-DÜYÜN** *sif.* Çoxlu düyünləri olan, düyünlü. *Düyün-düyün ağac. Düyün-düyün ip.* // Zərf mənasında. *Düyün-düyün olmaq.*

**DÜYÜNLƏMƏ** "Düyünləmək"dən *f.is.*

**DÜYÜNLƏMƏK** *f.* 1. Düyün edib bağlamaq, düyün vurmaq, düyün halına gətirmək. *İpləri bir-birinə düyünləmək. – O əllər məkik atmaqdan, .. odun kəsməkdən, ya da nazik qırıq ipək saplarını düyünləməkdən, cəhrə dolandırmaqdan, lülə sarımaqdan qabar olub ağaca dönmüşdür!..* Ə.Əbülhəsən. *Qadın bu pullara həsrətlə baxdı və nəhayət, onların beşini götürüb çarqatının ucuna düyünlədi.* P.Makulu.

2. Bir sıra tərkiblərdə işlənir: **əllərini düyünləmək** – b a x **əl**. **Yumruğunu düyünləmək** – b a x **yumruq**. **Qaşlarını düyünləmək** – b a x **qaşlarını çatmaq** (**"qaş"**da).

3. *məc.* Dərd olmaq, dağlandırmaq (bu mənada xalq ədəbiyyatında adətən "sinə" sözü ilə bərabər işlənir). *Təbib olsam, yaraların bağlaram; Sinəm üstə düyünlərəm, dağlaram.* Aşıq Ələsgər. [Kərəm:] *Dərdim, sinəm düyünlərəm, dağlaram; Ağ geymərəm, qaraları bağlaram.* "Əsli və Kərəm". *Bir xalın bənd edib aşiqi bağlar; Bir xalın sinəmi düyünlər, dağlar.* S.Rüstəm.

**DÜYÜNLƏNMƏ** "Düyünlənmək"dən *f.is.*

**DÜYÜNLƏNMƏK** *məch.* 1. Düyün edilib bağlanmaq, düyün vurulmaq.

2. *məc.* Dolaşmaq, mürəkkəbləşmək, çətinləşmək; yığılıb bir-birinə qarışmaq. *Yenə də əski xatirələr düyünlənib onun fikrini çulğaladı.* Ə.Vəliyev. *Dəmirov dönüb qayıtdı, onun alnında fikirlər düyünlənmişdi.* S.Rəhimov. *Lakin ağrı onun düyünlənmiş, ağır bir daş kimi onun ürəyindən asılmışdı.* Ə.Məmmədxanlı.

**DÜYÜNLÜ** *sif.* 1. Düyünü, ya düyünləri olan. *İlanlar fışıldayır kol-koslar arasından; Ayağa dolaşan düyünlü kəndir kimi.* S.Rüstəm.

2. Bir parçanın və s.-nin içinə qoyulub düyünlənmiş. *Papağının içindən əsgiyə düyünlü açarları çıxardır.* S.S.Axundov.

3. *məc.* Dolaşıq, mürəkkəb, çətinliklərlə dolu. *Ağbulaq kolxozu .. ölüm-dirimin düyünlü və döngəli yollarından keçib bu yüksəlişə çatmışdır.* S.Rəhimov.

4. *məc.* Dərdli, ürəyi dağlı. *Bu növcavan ilqarında doğrudur; Dərd əlindən düyünlüdür, dağlıdır.* (Qoşma). [Abbas:] *Sevdiyim əyninə geyibdi ağı; Çəkibdi sinəmə düyünlü dağı.* "Abbas və Gülgəz". *Telli deyir: dörd bir yanım bağlıdır; Sinəm üstü düyünlüdür, dağlıdır.* "Qaçaq Nəbi".

**DÜYÜRD** *is. məh.* Üzərində xırda düyünlər və toz kimi nöqtələr şəklində naxışı olan çarqat. *Bir az yaşlı qadınlar tünd rəngli xaralardan paltar geyib, başlarına da düyürdü kəlağayıdan çalma çalardılar.* H.Sarabski.

**DÜYÜTƏMİZLƏYƏN** *sif.* Çəltiyi təmizləyib düyü halına salan. *Düyütəmizləyən zavod. Düyütəmizləyən maşın.*

**DÜZ** 1. *sif.* Enişi, yoxuşu, çuxuru, təpəsi olmayan, hamar (səth haqqında). *Düz yer. Düz çöl. Düz meydança. Düz döşəmə. Düz taxta.*

2. *is.* Düzən, çöl, düzəngah, düzənlik. *Mil düzü. Cıdır düzü. Düzlərdə yaşayan əhali. – Cücələrim gəzə-gəzə; Səhər hindən çıxar düzə.* A.Səhhət. *Ağ kəfən geyindi düzlər, yamaclar; Nə bir ot göründü, nə də bir yarpaq.* S.Vurğun. *Yaradan insanlar, quran insanlar; Tutmuş başdan-başa geniş düzləri.* O.Sarıvəlli. *Lökbatan düzü .. buradan açıq-aydın görünürdü.* S.Rəhman.

3. *sif.* Əyintisi, əyrisi, döngəsi olmayan, düzgün istiqamətdə gedən, uzanan, duran; müstəqim. *Düz xətt. Düz sıra. – Ayrılıqmı çəkib, boynu əyridir? Heç yerdə görmədim düz bənövşəni.* Qurbani. *Xudayar bəyin burnu pis əyridi. Burnunun yuxarı tərəfindən bir sümük dikəlib. Sümük düzdü, amma aşağısının əti, xoruz pipiyi kimi düşüb sol yana.* C.Məmmədquluzadə. *Yolun hər iki tərəfində səliqə ilə becərilib qalxmış yam-yaşıl pambıq kollarının düz cərgələri uzanıb gedirdi.* Ə.Əbülhəsən.

4. *zərf* Dik, əyilmədən, sərrast. *Düz durmaq. Düz oturmaq. Düz yerimək.*

5. *zərf* Heç bir yana dönmədən; birbaşa. *Düz getmək. Buradan düz getsən, meydana çıxarsan.* // *məc.* Sakitcə, dinc. *Düz dur! Düz oturub-durmur. – Mən sənə məsləhət görürəm ki, öz yolunla düz keçib gedəsən.* "Koroğlu".

6. *zərf* Sərrast, dəqiq, kənara sapmadan, dübbədüz. *Nişanı düz vurmaq. Düz nişan almaq. – Xaspolad .. düz dəstəbaşının kəlləsini nişan alıb bağırırdı..* M.Hüseyn.

7. *Əd. mənasında.* Özündən sonra gələn sözə dəqiqlik verir. *Mən özüm anadan olmuşam düz otuz il bundan irəli.* C.Məmmədquluzadə. *Pilləkənlərdən yuxarı dırmaşan adam düz buraya, Səltənətin evinə gəlirdi.* Mir Cəlal. *Gözü qızmış buğa meydanın qızlar-gəlinlər yerləşən hissəsindəki ala-bəzək rəngləri görüb, düz oraya çapırdı.* M.Rzaquluzadə. *Məşədi Haşım düz yarım saat danışdı.* S.Rəhman.

8. *sif.* Doğruçu, namuslu, vicdanlı, hiyləsiz. *Sən bilmirsən ki, buraya düz adam gəlməz?* "M.N.lətif.". *Haşım bunları* [zəvvar və dərvişi] *düz və doğru adam bilib bunlarla tanış oldu.* B.Talıblı. // *İs. mənasında.* Doğruluq, düzlük. *Danışma heç bihesablıqdan; Yaxşı olur doğru, düzün axırı.* Aşıq Pəri. *Bir xəyanət görməyib bizdən; Əgrilik sadir olmayıb düzdən.* S.Ə.Şirvani.

9. *zərf* Düzgün, doğru. *Düz danışmaq. Düz deyirlər ki, ... – Əyri oturaq, düz danışaq.* (Ata. sözü). *Ovçu ovun düz görə; Düz dolana, düz görə; Mən yara neylədim ki; Atdı məni göz görə.* (Bayatı). *Zeynal çaldığı kimi oxuyardı da, iddia edərdi ki, çargahı özü kimi düz və doğru oxuyan yoxdur.* S.Hüseyn. *Fərhada elə gəldi ki, döyüşçü düz danışmır.* Ə.Vəliyev. // *sif.* Təmiz, vicdanlı, doğru, namuslu, sədaqətli. *Düz adam. Düz adama oxşamır.* ◻ **Düz olmaq** – doğruçu olmaq, səmimi olmaq, sədaqətli olmaq. *Sevgi gərək ola sevgisilə düz; Otura bir yerdə gecə və gündüz..* Q.Zakir. [Süleyman:] *Adam gərəkdir dostluqda düz ola.* Ü.Hacıbəyov.

10. Xəbər şəkilçisi ilə: **düzdür** – b a x **doğrudur ("doğru[1]"**da).

◊ **Düzbağırsaq** *anat.* – b a x **bağırsaq**. **Düz bucaq** – b a x **bucaq** 2-ci mənada. **Düz getməmək, düz gətirməmək** (işi və s.) – müvəffəqiyyətsizliyə uğramaq, müvəffəq ola bilməmək, bəxti gətirməmək. **Düz gəlmək** – müvafiq olmaq, uyğun olmaq. **Düz gəlməmək** – uyğunlaşmamaq, razılaşmamaq, yola gəlməmək, aralarında müvafiqət olmamaq. *O mənimlə heç düz gəlmir.* **Düz mütənasib** *riyaz.* – iki riyazi nisbətin bərabərliyi. **Düz olmaq** – müvafiq olmaq, münasib olmaq, uyğun gəlmək. *Jurnalü kitab yüz-yüz olmaz; Bu xərc ticarət düz olmaz.* M.Ə.Sabir. // b a x **düz gəlmək**. *Səg rəğib nə qədər sağdır, o dilbər; Bilirəm ki, bizim ilə düz olmaz.* Q.Zakir. **Düzdə (düzlərdə) qalmaq** – kimsəsiz, yoldaşsız, köməksiz ol-

maq, həmdərd tapmamaq. *Kor oldum, içmədim abi-kövsəri; Onunçun qalmamış düzlərdə, Zəhra!* (Qoşma). **Düzü əyri görmək** – bir şeyi qəsdən səhv izah etmək, yaxşı şeyə pis qiymət vermək. *Görürkən gözün düzü əyri; Bizdən əl çək də, çarə qıl gözünə.* M.Ə.Sabir. **Düzün ortasında qalmaq** – b a x **düzdə qalmaq**.

**DÜZBƏDÜZ** *zərf* Düz, birbaş. [Şölə xanım:] *Ay aman! Vəzir düzbədüz qapıya sarı gəlir.* M.F.Axundzadə.

**DÜZBUCAQ** *is.* Bütün bucaqları düz olan dördbucaq.

**DÜZBUCAQLI** *sif.* Bucağı (bucaqları) düz olan. *Düzbucaqlı üçbucaq. Düzbucaqlı bina.*

**DÜZCƏ** *sif.* və *zərf* Düz, tamamilə düz, həqiqətdə olduğu kimi. *Düzcə danışıq. Get, əhvalatı özünə düzcə danış. Düzcə get!*

**DÜZCIZIQLI** b a x **düzxətli**.

**DÜZ-DOĞRU** *zərf* Düz, birbaşa, bilavasitə. [Cəmaləddin:] *Sən .. qorxulu bir yola, bəlkə də düz-doğru ölümə gedirsən.* C.Cabbarlı. *Vidalaşıb düz-doğru Sərdarın yanına getdi.* M.S.Ordubadi.

**DÜZ-DÜNYA** *is.* 1. Aləm, hər tərəf, hər yer; ucsuz-bucaqsız sahə. *..Düz-dünyanı pambıq başına götürüb.* Ə.Haqverdiyev. [Bayram kişi:] *Sel gücü də məlumdur, odur, Mingəçevirdə bir dəsgah başlanıb ki, selin-suyun gücü ilə düz-dünyaya işıq və qüvvət verəcək..* M.Rzaquluzadə. *Düz-dünya lalə idi*. İ.Əfəndiyev.

2. B a x **dünya** 5-ci mənada. *Düz-dünya buraya axışdı. – Sən də düz-dünyanı qoyub, gedib onunla sövdalaşırsan.* S.Rəhimov.

**DÜZDÜRMƏ** "Düzdürmək"dən *f.is.*

**DÜZDÜRMƏK** "Düzmək"dən *icb. Muncuq düzdürmək.*

**DÜZDÜRÜLMƏ** "Düzdürülmək"dən *f.is.*

**DÜZDÜRÜLMƏK** "Düzdürmək"dən *məch.*

**DÜZ-DÜZYANA, DÜZ-DÜZÜNƏ** *zərf* Düz, doğru, açıq-açığına, ikiüzlülük etmədən. *Düz-düzyana danışmaq.*

**DÜZƏK** *is.* Yaraşıq, bəzək (adətən "bəzək-düzək" şəklində işlənir). *Neylərdim bəzəyi, ya düzəyi.* M.Ə.Sabir.

**DÜZƏKLİ** *sif.* Yaraşıqlı, bəzəkli. *Cücələrim bəzəklidir; Bəzəklidir, düzəklidir.* A.Səhhət.

**DÜZƏLDİCİ, DÜZƏLDƏN** *f.sif.* Qaydaya salan, tənzim edən; tənzimləyici.

**DÜZƏLDİLMƏ** "Düzəldilmək"dən *f.is.*

**DÜZƏLDİLMƏK** *məch.* 1. Düz və hamar edilmək.

2. Təşkil edilmək, əmələ gətirilmək, tərtib olunmaq, qurulmaq. *Məclis düzəldilmək.*

3. Qaydaya salınmaq, nizama salınmaq, yoluna qoyulmaq. // İslah edilmək, yaxşılaşdırılmaq.

**DÜZƏLDİLMƏZ** *sif.* Düzəldilə bilməyən, islah edilə bilməyən, islahedilməz.

**DÜZƏLDİLMƏZLİK** *is.* Düzəldilməz şeyin halı; islahedilməzlik.

**DÜZƏLİŞ** *is.* 1. Düzəlmə, düzəlişmə, razılaşma; saziş. *Düzəliş baş tutmadı.*

2. Düzəltmə, düzəldilmə; təshih etmə, təshih edilmə; təshih. *Kitabın axırında düzəliş verilmişdir.*

**DÜZƏLİŞDİRMƏ** "Düzəlişdirmək"dən *f.is.*

**DÜZƏLİŞDİRMƏK** *f.* 1. Düzəltmək, qaydaya salmaq. *Düzəlişdirdik işin hər yanını.* Ə.Nəzmi.

2. Sazişə gətirmək, aralarında saziş düzəltmək, razılıq yaratmaq, razılaşdırmaq.

**DÜZƏLİŞMƏ** 1. "Düzəlişmək"dən *f.is.*

2. *is.* Saziş.

**DÜZƏLİŞMƏK** *qarş.* 1. Bir-biri ilə sazişə gəlmək, razılaşmaq, öz aralarında razılığa gəlmək. *Kəbin halı-halına görə idi. Bəzən qudalar bunun üstündə düzəlişməzdilər.* H.Sarabski.

2. Düzəlmək, tarazlaşmaq. *Kosa tərəzini qaldırdı, bir növ tərəzi düzəlişdi.* S.Rəhimov.

**DÜZƏLMƏ** "Düzəlmək"dən *f.is.*

**DÜZƏLMƏK** *f.* 1. Düz və hamar şəklə düşmək; düzlənmək. *Çuxur düzəldi.*

2. Təşkil olunmaq, əmələ gəlmək, ibarət olmaq. *Müqim bəy .. bir neçə nahiyədən düzələn qəzanın rəisi oldu.* S.Rəhimov. *Həyatində yığıncaq düzəlmiş kəndli, Cavadı evinə dəvət etdi.* Ə.Vəliyev. // Tərtib olunmaq, qurulmaq. [Birinci məclis] *vaqe olur Mərcan bəyin otağında, otaq Avropa qaydasında düzəlmişdir.* Ü.Hacıbəyov.

3. Qaydaya düşmək, nizama düşmək, yoluna düşmək, başa gəlmək. *İşim düzəldi. – Düzəlib işlərin əskik-gərəki; Millətin dərdinə*

*dərman oldu.* M.Ə.Sabir. *Biz belə qanırıq ki, xəyal, fikir və əqidə düzəlməsə, fel heç vaxt düzəlməz.* C.Məmmədquluzadə. // İslah olunmaq, yaxşılaşmaq. *O, düzələn adam deyil. – ..Mahirənin həsrəti get-gedə artsa da, oğlanın ailə vəziyyəti düzəlməyirdi.* M.Hüseyn. [Göyüş dayı:] *Özünü incitmə, düzələn deyil; Ağlını itirib, olub bir səfil.* Z.Xəlil.

4. Dikəlmək, qalxmaq, şax durmaq, qəddini düzəltmək. *Qadın diksinmiş kimi, düzəlib şax durdu.* Mir Cəlal.

5. Kökəlmək, ətə-cana gəlmək. *At gündən-günə tükünü tüləyir, sağrısı düzəlirdi.* Ə.Vəliyev. // Sağalmaq, yaxşılaşmaq. *Xəstə idi, indi düzəlib.*

6. Bir səmtə tərəf üz tutmaq, getməyə başlamaq, getmək (bu mənada adətən "yola", "yoluna" və s. sözlərlə). *Qasım əmi ulağı minib və Pərinisəni tərkinə alıb düzəldi yola və şam vaxtı yavuqlaşdı kəndinə.* C.Məmmədquluzadə. *Mehriban kinli bir nəzərlə* [Zeynala] *baxdı. Yenə bir söz demədən yoluna düzəldi.* S.Hüseyn. *Eldar doğrudan da beşcə dəqiqəyə çaqqalı soyub dərisini çantasına qoydu və biz yola düzəldik.* M.Rzaquluzadə.

7. *məc. dan.* İşə girmək, bir vəzifə daşımağa başlamaq. *İşə düzəlmək. Haraya düzəldin?*

**DÜZƏLTDİRİLMƏ** "Düzəltdirilmək"dən *f.is.*

**DÜZƏLTDİRİLMƏK** "Düzəltdirmək"-dən *məch*.

**DÜZƏLTDİRMƏ** "Düzəltdirmək"dən *f.is.*

**DÜZƏLTDİRMƏK** "Düzəltmək"dən *icb.*

**DÜZƏLTMƏ** 1. "Düzəltmək"dən *f.is.*

2. *sif.* Başqasından (başqa kəmiyyətdən, sözdən və s.-dən) düzəldilmiş. *Düzəltmə sifət* (sözdüzəldici şəkilçilərin sözlərə bitişdirilməsi ilə düzələn sifət). *Düzəltmə fel* (müəyyən nitq hissələrinə sözdüzəldici şəkilçilərin artırılması ilə əmələ gələn fel). *Düzəltmə zərf* (sadə zərfin və ya başqa nitq hissəsinə aid olan sözün üzərinə müxtəlif sözdüzəldici şəkilçilərin artırılması ilə düzələn zərf).

3. Uydurma, yalan.

**DÜZƏLTMƏK** *f.* 1. Düz, saz hala salmaq, qaydaya salmaq, təmir etmək. *Fəhlələr xarab olmuş yolu düzəltdilər. Montyor işıq xəttini düzəltdi.* // Lazımi şəklə salmaq, tərtib və nizama salmaq, qaydaya salmaq. [Güləbətin] *üst-başını da düzəldirdi.* M.İbrahimov. [Zöhrə] *duru suya baxaraq saçlarını düzəltdi.* Ə.Vəliyev. *Qərənfil pəncərənin şüşəsinə baxıb kəlağayısını düzəltdi.* S.Rəhman. // Nöqsanları və s. çatışmazlığı aradan qaldırmaq. *Nöqsanları düzəltmək. Səhvini düzəltmək.* // İslah etmək, yaxşılaşdırmaq. *Xasiyyətini düzəltmək. Adamlara qarşı münasibətini düzəltmək. – Qoy təşkilat onu intizam altına alıb düzəltsin.* M.S.Ordubadi.

2. Vücuda gətirmək, yaratmaq, qayırmaq, hazırlamaq, qurmaq. *Quşlar özlərinə yuva düzəltdilər. – Telli dişi ilə, dırnağı ilə çalışmış, axırda İslam üçün əməlli-başlı bir ev-eşik düzəltmişdir.* S.Hüseyn.

3. Cürbəcür vasitələrlə, yollarla əldə etmək, tapmaq. *Yol üçün pul düzəltmək. Özünə təzə paltar düzəltmək. Teatra bilet düzəltdinmi?* // Təşkil etmək, yaratmaq, həyata keçirmək (bir işi, tədbiri). *Tamaşa düzəltmək. Sərgi düzəltmək. Ziyafət düzəltmək. Şənlik düzəltmək.* // Yaratmaq, vücuda gətirmək, təşkil etmək. *İndi də diş həkimləri hazırlamaq üçün texnikum düzəldirlər.* C.Məmmədquluzadə. // Qurmaq, fikirləşib hazırlamaq. [Slavaçinski:] *Elə hiylə düzəltmək lazımdır ki, Nəbi özü gəlib bizə təslim olsun.* "Qaçaq Nəbi".

4. Bir yerə (işə, məktəbə və s.-yə) qəbul olunmasına kömək etmək, vasitə olmaq. *İşə düzəltmək. Onu düzəlt, bizdə işləsin. Məktəbə düzəltmək. Sanatoriyaya düzəltmək.*

**DÜZ-ƏMƏLLİ** *zərf* və *sif.* Yaxşı, lazımi qaydada, layiqli surətdə. [Pərzad:] [Qızı] *düz-əməlli saxlamırsınız, .. bu nədir, qız mum kimi əriyir.* Mir Cəlal. [Turac:] *Ey, düz-əməlli danış, ha!* İ.Əfəndiyev.

**DÜZƏN** *is.* Düz yer, düz, çöl. *Mal-qara düzəndə gəzir. – Bu Lökbatan bir düzəndi; üstü lehməli; Onu abad etdi azad insanın əli.* R.Rza. *Yaşıl düzəndə bir kənd... Kirəmitli daxmalar...* M.Rahim. *Düzənlərdə göyərər; Yaşıl bağlar, meşələr.* M.Seyidzadə.

**DÜZƏNGAH** *is.* Düz, düzən, düzənlik. *Yolun o tərəf-bu tərəfi göz işlədiyi qədər düzəngahdır. – ..Çıxaq bir uca dağın başına;*

*baxıb görəcəgik ki, dörd bir ətrafdan göy yapışıb yerə və baxıb görəcəgik ki, yerin üzü meydan kimi bir düzəngahdı.* C.Məmmədquluzadə. *Binə kəndindən Saray bağlarının ətəyinədək uzanan düzəngaha Təmənnis deyərdilər.* H.Sarabski.

**DÜZƏNGAHLIQ** *is.* Düzəngah yer, düzənlik, düzən.

**DÜZƏNLİK** *is.* Düzən, düzəngah. *Mən indidən görürəm o büsatı, şənliyi; Görürəm çiçək açır Kür-Araz düzənliyi.* Ə.Cəmil.

**DÜZƏNMƏ** "Düzənmək"dən *f.is.*

**DÜZƏNMƏK** *f.* Bəzənmək, geyinmək (çox vaxt "bəzənib-düzənmək" şəklində işlənir). *Rövşən içəri otağa girdi, kişi paltarını çıxartdı, bir dəst arvad paltarı geydi, bəzəndi, düzəndi, topuğuna qədər düşən saçlarını darayıb enişə tökdü.* (Nağıl).

**DÜZGÜ** *is.* Düzmə işi; düzmə (düzülmə) qaydası, üsulu; düzülüş, sıra, sıralanma.

**DÜZGÜN** *sif.* Düz, doğru. *Düzgün söz. Düzgün hərəkət. Düzgün tələffüz.* // b a x **düz** 8-ci mənada. *Düzgün adam.* // *zərf* Öz qaydasında, öz yerində, lazımi qaydada. [Hacı Nəsir:] *Hərgah mənim işlərim əvvəlki kimi düzgün olsaydı, sənə əl tutardım.* S.S.Axundov.

**DÜZGÜNLƏŞDİRİLMƏ** "Düzgünləşdirilmək"dən *f.is.*

**DÜZGÜNLƏŞDİRİLMƏK** *məch.* Düzgün edilmək, düzgün hala salınmaq, qaydaya salınmaq, nizama salınmaq.

**DÜZGÜNLƏŞDİRMƏ** "Düzgünləşdirmək"dən *f.is.*

**DÜZGÜNLƏŞDİRMƏK** *f.* Düzgün hala salmaq, qaydaya salmaq, nizama salmaq. [Yaşar:] *Əlbəttə, suvarma işlərini düzgünləşdirməklə qızdırmanı da aradan qaldırmaq olar.* C.Cabbarlı.

**DÜZGÜNLƏŞMƏ** "Düzgünləşmək"dən *f.is.*

**DÜZGÜNLƏŞMƏK** *f.* Düzgün şəklə düşmək, düzgün olmaq, qaydaya düşmək, nizama düşmək.

**DÜZGÜNLÜK** *is.* Düzlük, doğruluq. *Fikrin düzgünlüyü. Tələffüzün düzgünlüyü.*

**DÜZXƏTLİ** *sif.* Düz istiqamətlə gedən, düz xətlə gedən (uzanan, yerləşən).

**DÜZQAMƏT(Lİ)** *sif.* Qaməti düz, sərrast. *İmran kişi üzdən arıq və cansız görünən, ucaboy, şax dayanan, düzqamətli bir kişi idi.* M.Hüseyn.

**DÜZQANADLILAR** *is. zool.* Çəyirtkə və s. əhatə edən həşərat dəstəsi.

**DÜZQƏLBLİ** *sif.* Təmizürəkli, səmimi, ürəyiaçıq. *Düzqəlbli adam.*

**DÜZQƏLBLİLİK** *is.* Təmizürəklilik, səmimilik, ürəyiaçıqlıq.

**DÜZLƏMƏ** "Düzləmək"dən *f.is.*

**DÜZLƏMƏK** *f.* Düzən halına salmaq, hamarlamaq, çala-çuxurunu düzəltmək. *Buldozerlər yeri düzləyir. – Od-alov nəfəsli, çarxlı nəhənglər; Yüz çuxur doldurur, təpə düzləyir.* S.Vurğun.

**DÜZLƏNDİRİCİ** *is. tex.* Dəyişən elektrik cərəyanını sabit cərəyana çevirən alət, cihaz. *Müasir elektrotexnikada dəyişən cərəyanın sabit elektrik cərəyanına çevrilməsinə olan ehtiyac günü-gündən artır. Bu məqsədlə işlədilən qurğulara düzləndirici deyilir.* H.Abdullayev.

**DÜZLƏNDİRİLMƏ** "Düzləndirilmək"dən *f.is.*

**DÜZLƏNDİRİLMƏK** *məch.* Düzən halına salınmaq, hamarlandırılmaq, çala-çuxuru düzəldilmək.

**DÜZLƏNDİRMƏ** "Düzləndirmək"dən *f.is.*

**DÜZLƏNDİRMƏK** *f.* 1. Düz, hamar hala sal(dır)maq, hamarlandırmaq. *Bu yerin çala-çuxurunu düzləndirmək lazımdır.*

2. *tex.* Nizamlamaq, tənzim etmək.

**DÜZLƏNMƏ** "Düzlənmək"dən *f.is.*

**DÜZLƏNMƏK** 1. *məch.* Düz hala salınmaq. *Çala-çuxurlar düzləndi.*

2. *t-siz.* Düz olmaq, düz hala gəlmək, hamarlanmaq.

**DÜZLƏŞDİRİLMƏ** "Düzləşdirilmək"dən *f.is.*

**DÜZLƏŞDİRİLMƏK** b a x **düzləndirilmək**.

**DÜZLƏŞDİRMƏ** "Düzləşdirmək"dən *f.is.*

**DÜZLƏŞDİRMƏK** b a x **düzləndirmək**.

**DÜZLƏŞMƏ** "Düzləşmək"dən *f.is.*

**DÜZLƏŞMƏK** b a x **düzlənmək** 2-ci mənada.

**DÜZLÜK** *is.* 1. Düz, düzəngah, düzənlik, düzən; quru çöl. *Dərə-təpədən düzlüyə çıxdıq.*

– [Araz Şeydaya:] *Sən məni hara çəkirsən? Sizin bu mədənlərdə düzlükdən başqa bir şey var?* A.Şaiq.

2. Doğruluq, vicdanlılıq, sədaqət, namusluluq, təmizlik, namuskarlıq. *Bərəkət ondur, onu da düzlük.* (Ata. sözü). *Gənclik həmişə yüksək və təmiz xəyalların, düzlük və sədaqətin mücəssəməsidir.* M.İbrahimov.

**DÜZMƏ** 1. "Düzmək"dən *f.is.*

2. *is.* Kələk, hiylə, fırıldaq. *A qoca bic!.. Yenə nə olub, nə düzmən var?* S.Rəhman.

◊ **Düzmə hörgü** – palçıq və qeyri yapışdırıcı maddələr işlətmədən hörülən hörgü.

**DÜZMƏK** *f.* 1. Dənə halında olan şeyləri sıra ilə ipə və s.-yə keçirmək. *Muncuğu sapa düzmək.*

2. Müəyyən tərtib və qayda üzrə şeyləri bir yerə qoymaq, yerləşdirmək, sıralamaq. *Sıraya düzmək. Şahmat daşlarını düzmək. Kitabları şkafa düzmək.* – [Pərşan] *həsir şlyapasının da qıraqlarına lalə düzmüşdü.* M.İbrahimov. // Hərəni bir yerə qoymaq. *Səliqəli maldarlar .. çöldən naxır qayıdan zaman oğul-uşağı düzərlər qapılara ki, camışlar, öküzlər, inək və danalar düz girsinlər tövlə həyatinə.* C.Məmmədquluzadə. ☐ **Düzüb-qoşmaq** – tərtib etmək, səliqəyə salmaq, qaydaya salmaq, sahmana salmaq, yerbəyer etmək. *Qız köçəndə gətirdiyi cehizi ilə bir göz otağı hər bir cəhətdən düzüb-qoşmaq və mətbəxin hacətlərini təmin etmək hər gəlin üçün adət edilmişdir.* R.Əfəndiyev. *Xəstəxananın hər bir işini düzüb-qoşduqdan sonra Rəşid ata və anasına dedi..* İ.Musabəyov. // *məc.* Sıralamaq, bir-birinin ardına qoşmaq. *Budur, bax, az qalmış yenə səhərə; Düzürəm sözləri mən sətirlərə.* S.Vurğun. [Halay:] *..Heyf ki, iki misranı qurub bir-birinin yanına düzə bilmirəm.* S.Rəhimov.

3. *klas.* Qurmaq, düzəltmək. *Daneyi-xalın cəhanı tutdu çün; Türrədən neyçün düzərsən bunca dam?* Nəsimi. *Dözmək üçün hicrinə düzdün dəmirdən bir könül.* Füzuli. *...Həmişə çox gəzib yorulanda burada dincimi alırdım. Böyük daşlardan düzüb özümə bir meysərə, səndələ oxşar bir yer qayırmışdım.* A.Divanbəyoğlu.

**DÜZNƏQULU** *zərf dan.* Açıq-açığına, heç bir şeydən çəkinməyərək, necə var elə, olduğu kimi, düz.

**DÜZÜ** *is.* Doğrusu (bəzən "sözün" sözü ilə birlikdə). *Eşitginən Koroğlunun sözünü; Mən bilirəm əyrisini, düzünü.* "Koroğlu". *Sözün düzünü desək, Fərman ekskavatorçu olmaq həvəsinə düşəndə bu iş üçün əməllibaşlı dərindən oxumaq lazım gələcəyini bilmirdi.* Ə.Sadıq. *Amma Bayram kişi mübaliğə etmir, düzünü deyirdi.* M.Rzaquluzadə. // Ara söz kimi – açıq desək, doğrusunu desək. *Düzü, mənə bu, şübhəli gəlir. Düzü, biz ondan narazıyıq.*

**DÜZÜCÜ** *is.* Bir şeyi düzməklə məşğul olan adam.

**DÜZÜLMƏ** "Düzülmək"dən *f.is.*

**DÜZÜLMƏK** *f.* 1. Sıra ilə ipə və s.-yə keçirilmək. *Muncuqlar ipə düzüldü.*

2. Müəyyən bir tərtib və qayda ilə bir yerə qoyulmaq, yerləşdirilmək. *Uşaqlar boylarına görə düzüldülər. – Taxçalara düzülübdü bir neçə samovar, sandıqca .. və xırdavat şeylərdən.* C.Məmmədquluzadə. *Ləməyə iki çin əlvan-zərli çini kasa və boşqab düzülərdi.* H.Sarabski. *Zala şəhərdən gətirilmiş yumşaq stullar düzülmüşdü.* Ə.Məmmədxanlı. // Müəyyən bir qayda ilə durmaq, dayanmaq, yerləşmək. *Rüxsarına qoşa xallar düzülüb; Yoluna baxmaqdan canım üzülüb..* Q.Zakir. *Bu ümid ilə ki, qəmzəndən ala kami-dilin; Düzülüb gözlərinin dövrünə müjgan səf-səf.* S.Ə.Şirvani.

**DÜZÜLÜ** *sif.* 1. Düzülmüş. *İpə düzülü muncuq.*

2. Müəyyən qaydada qoyulmuş, səliqə ilə düzülmüş, sıralanmış. *Düzülü kitablar.*

**DÜZÜLÜŞ** *is.* 1. Düzülmə tərzi, düzülmə qaydası; tərtib. *Muncuqların sapa düzülüşü yaxşı deyil.*

2. Düzülmə işi (b a x **düzülmək** 2-ci mənada). *Əsgərlərin sıraya düzülüşü beş dəqiqə çəkmədi.*

**DÜZÜLÜŞMƏ** "Düzülüşmək"dən *f.is.*

**DÜZÜLÜŞMƏK** *qarş.* Bir-birinə baxaraq düzülmək. *Sıraya düzülüşmək. Boya görə düzülüşmək.*

**DÜZÜM** *is.* 1. Bir ipə düzülmüş miqdar. *Bir düzüm muncuq. Bir düzüm qax. – Savadın əlində köhnə bir dəsmal; İçində şabalıd,*

*fındıqla üzüm; Qozlu sucuqlardan beş-altı düzüm.* H.K.Sanılı. *Bu hədiyyə iki düzüm; Kəhrəbaydı, rəngi sarı*. M.Dilbazi.

2. Düzülmə, sıralanma, tərtib qaydası; sıra. *Segah, çargah, rast, şur, hümayun və s. Azərbaycan muğamları əsasında yaranmış Azərbaycan xalq mahnıları bu muğamlar kökündə olan səs düzümləri ilə üzvi surətdə bağlıdır.* Ə.Bədəlbəyli.

**DÜZÜNƏ** *zərf* 1. Düz, doğru. *Düzünə danış.* // Doğrusu, həqiqəti əsli. *Düzünə gəlincə, bu məlumat .. yan-yörədə əyləşən daqqapapaqlıların da ödünü ağzına gətirmişdi*. S.Rəhimov.

2. Düz yolla, heç bir tərəfə dönmədən. *Bu yolla düzünə get*.

**DÜZÜRƏKLİ** *sif.* Ürəyi təmiz, səmimi, doğru, düz. *Düzürəkli adam.*

**DÜZÜŞ** *is.* Düzmə işi, düzmə tərzi, düzmə prosesi.

**DÜZÜŞDÜRMƏ** "Düzüşdürmək"dən *f.is.*

**DÜZÜŞDÜRMƏK** *f.* Növ-növ, çeşid-çeşid, boy-boy düzmək, sıralamaq, qoymaq, yerləşdirmək. *Malları, kitabları qəfəsəyə düzüşdürmək.*

**DÜZÜŞMƏ** "Düzüşmək"dən *f.is.*

**DÜZÜŞMƏK** *f.* Düzülmək (bir çoxları).

**DÜZVURAN** *sif.* 1. Sərrast atıcı, hədəfi sərrast vuran. *Düzvuran nişançı.*

2. Düzgün vuran, yaxşı atan. *Düzvuran tüfəng.*

**DVORYAN** [*rus*. дворяни́н] *tar*. 1917-ci il inqilabından əvvəl Rusiyada: mülkədarlardan, onların nəslindən və xüsusi xidməti olan məmurlardan ibarət imtiyazlı zümrəyə mənsub adam; zadəgan. *..Orta hesabla hər bir kəndli ailəsinə yeddi desyatin, bir dvoryan latifundiyasına isə 2333 desyatin, yəni 333 dəfə artıq torpaq düşürdü.* [Nikolay:] [Fedosiya] *kobud hərəkət etmişdir, mən bir dvoryan kimi bunu etiraf edirəm.* Çexovdan.

**DVORYANLIQ** *is. tar*. Dvoryan zümrəsinə mənsubiyyət, dvoryan rütbəsi, adı. *Lakin* [atam] *zabit rütbəsinə qədər qalxaraq bizə nəsillikcə dvoryanlıq və balaca bir malikanə qoyub getdi*. Çexovdan.

**DYAÇÓK** [*rus*. дья́чок əsli *yun*.] Pravoslavlarda: ruhani rütbəsi olmayan kilsə xadimi.

**DYÁKON** [*rus*. дья́кон əsli *yun*.] Pravoslavlarda: ibadət zamanı keşişə kömək edən kilsə xadimi.

**DYAKONLUQ** *is.* [*rus*.] Dyakonun işi, peşəsi, məşğuliyyəti.

# MÜNDƏRİCAT

